**Tərtib:**
**Zeynuddin Əhməd ibn Əhməd**
**ibn Abdul-Lətif əz-Zəbidi**

# Səhih əl-Buxari

**<u>müxtəsər</u>**

**İkinci nəşr**

**Ərəb dilindən tərcümə edən**
**Əlixan Musayev**

## Redaksiya heyəti

**Ə. Z. Musayev**
**M. N. Qarayev**
**A. X. Salehli**
**S. Q. Hacı**
**S. Z. Səfərbəyov**
**G. İ. Musayeva**
**M. Ə. Əliyeva**

## Kompüter tərtibatı

**E. Q. Rüstəmov**
**Ə. Z. Musayev**
**M. N. Qarayev**

*Şübhəsiz ki, bu tərcümə insan əməyinin bəhrəsidir. Demək, burada xətaların olması da labüddür. Odur ki, öz düzəlişlərini, qeyd və mülahizələrini aşağıdakı elektron ünvana göndərəcək oxuculara əvvəlcədən təşəkkürümüzü bildiririk. Sizin dəyərli məsləhətləriniz bu kitabın gələcək nəşrlərində mütləq nəzərə alınacaqdır.*

Burhan_az@hotmail.com

**Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin razılığı ilə çap edilmişdir.**
**(DK-108/M 12.05.2009)**



## *Mərhəmətli və Rəhmli Allahın adı ilə!*

## *Ön söz*

Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱتَّقُوا۟ ٱللَّهَ حَقَّ تُقَاتِهِۦ وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنتُم مُّسْلِمُونَ ١٠٢﴾

**“Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!”**[1]

﴿يَٰٓأَيُّهَا ٱلنَّاسُ ٱتَّقُوا۟ رَبَّكُمُ ٱلَّذِى خَلَقَكُم مِّن نَّفْسٍ وَٰحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالًا كَثِيرًا وَنِسَآءً ۚ وَٱتَّقُوا۟ ٱللَّهَ
ٱلَّذِى تَسَآءَلُونَ بِهِۦ وَٱلْأَرْحَامَ ۚ إِنَّ ٱللَّهَ كَانَ عَلَيْكُمْ رَقِيبًا ١﴾

**“Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə birbirinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir”.**[2]

﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ ٱتَّقُوا۟ ٱللَّهَ وَقُولُوا۟ قَوْلًا سَدِيدًا ٧٠ يُصْلِحْ لَكُمْ أَعْمَٰلَكُمْ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ ۗ وَمَن يُطِعِ
ٱللَّهَ وَرَسُولَهُۥ فَقَدْ فَازَ فَوْزًا عَظِيمًا ٧١﴾

**“Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar”.**[3]

Bizi müsəlman kimi yaradan, düz yola yönəldərək hidayət verən, aləmlərin Rəbbi, haqq-hesab gününün Hökmdarı olan Allaha şükürlər və həmd-sənalar olsun!

---

[1] “Ali-İmran”, surəsi, 102.
[2] “ən-Nisa”, surəsi, 1.
[3] “əl-Əhzab”, surəsi, 70-71.

Hörmətli oxucu!

Son zamanlar xalqımızın kütləvi surətdə İslam dininə qayıdışını əks etdirən həyatı faktlar olduqca ürəkaçan və sevindiricidir. İslam ümumbəşəri din olaraq insanların etiqadının, əxlaqının, ictimai dəyərlərin paklaşmasına xidmət edir. Dinimizin təməli Müqəddəs Kitab – Qurani Kərim və peyğəmbərlərin sonuncusu və şərafətlisi Muhəmməd peyğəmbərin ﷺ həyatı, əməlləri, öyüd-nəsihətləri və əmrləridir, yəni sünnəsidir.

Sizə təqdim olunan bu kitab məhz sünnəni özündə əks etdirir və Qurani Kərimdən sonra yer üzündə ən səhih kitab hesab olunur. Artıq 12 əsrdən çox vaxt keçməsinə baxmayaraq, kitabda qeyd olunmuş hədislər bütün alimlər tərəfindən səhih hesab edilmiş və bu gün də hesab edilməkdədir. Hədisləri öyrənib öyrətmək dini öyrənib öyrətməkdir. Və bu gün cəmiyyətimizə məhz səhih hədislərə əsaslanan sünnəni təbliğ etmək dini qorumağa və yaşatmağa bənzəyir. Belə ki, milyonlarla zəif və uydurma hədislərin arasından xüsusi elmi metodlara əsaslanaraq seçilmiş səhih hədislər bütün müsəlman ümmətinin vahid və etibarlı sünnəsindən dayaq kimi istifadə edilməsinə zəmin yaradır. Yuxarıda qeyd edildiyi kimi Muhəmməd peyğəmbərə ﷺ itaət, daha doğrusu bu günə qədər qorunmuş səhih hədislərə əsaslanan sünnəyə itaət, İslam dinimizin əsaslarındandır.

Peyğəmbərdən ﷺ nümunə götürmək onun hərəkətlərini onun özünün etdiyi kimi etmək deməkdir. "Muhəmməd Allahın elçisidir" şəhadətinin də mənası elə budur. Müsəlman buna əməl etmədən müsəlman ola bilməz. Bu, elə bir meyardır ki, insanların hərəkətləri, sözləri, əqidələri və başqa işləri onunla ölçülməlidir. Peyğəmbərdən ﷺ nümunə götürmək bütün din işlərində onun göstərdiyi doğru yolu, onun özünün həyat yolunu, hədislərini öyrənib onlara əməl etməyə əsaslanır. Buna görə də uca Allah ona arxa olmağı və onun böyüklüyünü gözləməyi bizə fərz buyuraraq demişdir:

**"Həqiqətən, Biz səni şahid, müjdəçi və xəbərdarlıq edən *elçi* kimi göndərmişik. *Biz belə etdik* ki, siz Allaha və Onun elçisinə iman gətirəsiniz, ona kömək edəsiniz, onun hörmətini saxlayasınız və gecə-gündüz *Allahı* tərifləyəsiniz."**[1]

**"Allahın Elçisi sizlərə – Allaha və Axirət gününə ümidini bağlayanlara və Allahı çox zikr edənlərə gözəl nümunədir."**[2]

Bu ayələr Allahın elçisinin sözlərindən, hal və hərəkətlərindən nümunə götürməyin vacib olduğunu sübut etmək üçün böyük bir əsasdır.

İmam Buxarinin "əl-Cami əs-Səhih" kitabı əsrlər boyu bütün hədis toplumları arasında ən mötəbər və nüfuzlu sayılmışdır. Bu kitaba daxil edilmiş bütün hədislər səhihdir və mövzular üzrə tərtib edilmiş və fiqh elmində ən mühüm rəhbərlik kimi qəbul edilmişdir.

Bir çox alimlər kitabın müxtəsər variantını yazmış və lakin əsrlərlə məşhur olan müxtəsər kitab Əhməd ibn Abdul-Lətif əz-Zəbidiyə məxsusdur. Bunun təsdiqi olaraq

[1] "əl-Fəth" surəsi, 8-9.
[2] "əl-Əhzab" surəsi, 21.

qeyd etmək lazımdır ki, bu müxtəsər variant uzun bir müddət ərzində dəfələrlə nəşr edilmiş, bir çox dillərə tərcümə olunmuş və din alimlərinin masaüstü kitabına çevrilmişdir. Çox sevindirici haldır ki, bizim də xalqımız artıq bu faydalı kitabı öz dilində oxumaq imkanı əldə etmişdir.

"Səhihə" daxil edilmiş yeddi mindən bir qədər çox hədisin Buxarinin yoxladığı materialın ancaq az bir hissəsi olmasına baxmayaraq, onlar həcm etibarilə olduqca böyükdür və kitabın əməli məqsədlərdən ötrü istifadə edilməsi üçün rahat deyil. Bununla əlaqədar müxtəlif vaxtlarda bu toplunun bir-neçə müxtəsər variantı tərtib edilmişdir ki, onlardan ən uğurlu variant imam Əhməd bin Abdul-Lətif əz-Zəbidiyə mənsubdur.

Bu variantda hədislərin isnadı, fəsillərin adları, və habelə, demək olar ki, bütün təkrarlanan hədislər ixtisar edilmişdir və nəticədə onların ümumi sayı 2221 olmuşdur. Lakin bütün mətnlər, başqa cürə desək, hədislərin məlumat daşıyıcı əsas hissələri tam saxlanılmışdır ki, bu da oxucuda əl-Buxarinin çəkdiyi zəhməti haqqında aydın təsəvvür yaranmasına imkan verir və həm də buna sərf ediləcək zəruri vaxtı əhəmiyyətli dərəcədə qısaldır.

Tərcümə edilib hazırlanmış material, kitabın istifadə olunmasını asanlaşdırmaq üçün onu fəsillərə bölməyi nəzərə almasaq, imam əz-Zəbidinin "Səhihinin" müxtəsər variantına tamamilə uyğundur[1].

Tərcümə üzərində işin gedişatında "Səhih"in orta əsr şərhçiləri olan ibn Həcər Əsqəlaninin, Şihabəddin Əhməd bin Muhəmməd əl-Qəstallaninin və Əbu Muhəmməd Mahmud bin Əhməd əl-Ayninin əsərlərindən istifadə edilmişdir. Sünnənin çox böyük əhəmiyyətini və Peyğəmbərin ﷺ dediyi bir sözün və onun əməllərinə aid olan hər hansı, hətta, ilk nəzərdə, ən kiçicik görünən təfərrüatın da təhrif edilməsinin yolverilməzliyini nəzərə alaraq, öz əsas vəzifəmi onda görmüşəm ki, tərcümə mümkün qədər onların mənasına, leksik və ifadə vasitələrinə tam uyğun gəlsin. Ərəb mətnində olan sözlərin göstərilməsinə və azərbaycan dilində səslənməsi üçün hansı sözlərin işlədilməsi zəruriliyinə can atmağım məni şərti işarələrdən istifadə etməyə yönəltdi. Belə ki, ərəb mətnində olmayan, lakin cümlənin başa düşülməsi üçün lazım gələn sözlər mötərizələrdə verilir.

"Əbu" (ata), "ummu" (ana), "ibn" (oğul), "bint" (qız), "bəni" (oğullar) sözləri xüsusi adların və ya qəbilələrin adlarının tərkib hissələridir.

Kitabda peyğəmbərlərin, əshabələrin və tabiinlərin adlarına bitişik yazının nə olduğunu bildirmək istərdim. Əvvəla ﷺ işarəsinin oxunuşu "salləllahu aleyhi və sələm", mənası isə "ona Allahın salavatı və salamı olsun!" bildirir.

[1] "Səhihin" bəzi fəsillərinin adı yoxdur. Bundan başqa, bir sıra hallarda fəsillərin adları bu fəsildəki hədislərin məzmununa uyğun gəlmir. Bu onunla izah edilir ki, bu topluya əl-Buxarinin toplusundakı hədislərin hamısı daxil edilməmişdir. Belə hallar, fəsillərin adlarına uyğun gələn hədislərin əz-Zəbidi tərəfindən öz toplusuna daxil edilməməsi ilə bağlıdır.

﵁ və ya ؓ işarəsi “radıyallahu anhu” kimi oxunur və “Allah ondan razı olsun!” mənasını verir (kişi cinsinə aid edilir);

﵂ işarəsi “radıyallahu anhə” kimi oxunur və “Allah ondan razı olsun!” mənasını verir (qadın cinsinə aid edilir);

﵄ işarəsi “radıyallahu anhumə” kimi oxunur və “Allah onların ikisindən də razı olsun!” mənasını verir;

﵃ və ya ؓ işarəsi “radıyallahu anhum” kimi oxunur və “Allah onlardan razı olsun!” mənasını verir;

﵇ işarəsi “aleyhissəlam” kimi oxunur və “ona Allahın salamı olsun!” mənasını verir (kişi cinsinə aid edilir);

﵍ işarəsi “aleyhəssəlam” kimi oxunur və “ona Allahın salamı olsun!” mənasını verir (qadın cinsinə aid edilir);

﵉ işarəsi “aleyhiməssəlam” kimi oxunur və “hər ikisinə Allahın salamı olsun!” mənasını verir;

﵀ işarəsi “rahiməhullah” kimi oxunur və “Allah ona rəhmət etsin!” mənasını verir.

Bütün zəruri hallarda, məsələn bu və ya digər sözlər ikimənalı başa düşüldüyü və ya bəzən nəinki İslamdan uzaq olan adamlar, hətta bir çox müsəlmanların da başa düşə bilməyəcəyi ifadələrə mətndə elə rast gəlindiyi hallarda, lazımi şərhlər verilir. İslam tarixinin mühüm hadisələri və Peyğəmbərin ﷺ bəzi ən görkəmli əshabələri haqqında və habelə ayrı-ayrı tarixi şəxsiyyətlər haqqında xatırlanan hədislər müvafiq sətiraltı qeydlərlə təchiz edilmişdir.

*03.03.2009*

# *İmam əl-Buxarinin həyatı*

### əl-Buxarinin adı və nisbəsi[1]

İmam əl-Buxari hicri 194-cü ilin şəvval ayının on biri cümə günü Buxarada anadan olmuşdur. O, atasını tez itirmiş və erkən uşaqlıq çağında gözləri tutulmuşdur. Bir müddət sonra anası yuxusunda İbrahim peyğəmbəri ﷺ görmüş və ondan bu sözləri eşitmişdir: "Ey filankəs, sənin çoxsaylı dualarına görə Allah sənin oğluna görmə qabiliyyətini qaytardı".

Hələ uşaq ikən Allah ona hədisləri yadda saxlamaq istedadı bəxş etdi. Əbu Cəfər Muhəmməd ibn Əbu Hatim əl-Bərrak demişdir: "Bir dəfə mən Əbu Abdullah əl-Buxaridən soruşdum: "Sən hədisləri necə öyrənməyə başlamısan?" O, belə cavab verdi: "Yaşım on və ya ondan da az olarkən mən yenicə oxumağı öyrənməyə başlayanda hədislərin yadda saxlanılmasının zəruriliyi fikri mənə təlqin edilmişdi. Sonra mən məktəbi tərk etdim və gah bu və gah da başqa bir müəllimin yanında oxumağa başladım. On altı yaşım tamam olanda mən artıq ibn Mübarəkin və Vəkinin kitablarını və onların rəylərini əzbər bilirdim. Sonra anam və qardaşımla birlikdə Məkkəyə getdim və hədisləri toplamaq məqsədilə orada yaşamağa başladıq. On səkkiz yaşım olduqda isə əshabələr və onların ardıcılları və onların fikir və rəyləri haqqında məlumatları toplayıb kitab halına salmağa başladım"".

İmam əl-Buxari özünü tamamilə elmə və ibadətə həsr edir. O, tez-tez belə deyərdi: "Mən həyatım boyu heç kimdən bir dirhəmlik də olsa bir şey satın almamışam və heç kimə bir dirhəmlik də belə olsa bir şey satmamışam." Bir dəfə ondan soruşurlar ki, bəs çörəyi necə almışdır? Bu suala əl-Buxari belə cavab vermişdir: "Mən bunu kiməsə tapşırardım, onlar da mənim üçün alardılar."

İmam əl-Buxari hədsiz utancaqlıqla, cəsarəti, əliaçıqlığı, möminliyi, bu dünyanın nemətlərindən uzaq durması və əbədiyyətə can atması ilə fərqlənərdi. Bir dəfə o demişdir: "Həqiqətən, mən istərdim ki, Uca Allahla görüşərkən heç kim məni danlamasın".

İmam əl-Buxari şəxsi ləyaqət və məğrurluq hissinə malik idi. Bir dəfə bir hökmdar uşaqlarına dərs vermək üçün onun dalınca adam göndərir, lakin Buxari ona xəbər göndərir ki, elm axtaranlar bilənlərin yanına özləri gəlməlidir və hökmdarın yanına getməkdən imtina edir.

O, gündüzlər tez-tez oruc tutar, gecələr namaz qılar və, xüsusilə mübarək Ramazan ayında çoxlu Quran oxuyardı. Əbu Bəkr əl-Bəğdadi rəvayət edir ki, Məsih bin Səid demişdir: "Ramazanın birinci gecəsi girən kimi Muhəmməd bin İsmail əl-Buxarinin dostları onun yanında yığışardı və o, onlarla birlikdə namaz qılar, hər rükətdə Qurandan iyirmi ayə oxuyaraq onu tamam başa çatdırardı".

[1] Nisbə - qəbilə, tayfa, şəhər, yer və s. üzrə mənşəyi bildirən nisbi adlar.

Bundan başqa, imam əl-Buxari Quranı hər gün iftardan qabaq tam oxuyub qurtarar və deyərdi: "Quran oxunub qurtardıqdan sonra edilən dua cavabsız qalmır".

Bir dəfə, o, namaz qılarkən, eşşəkarısı onu on yeddi dəfə çalmışdı. Namazı bitirdikdən sonra, o dedi: "Baxın görün namaz vaxtı məni narahat edən nə idi?" Adamlar baxdıqda məlum oldu ki, onun bədənində eşşəkarısının sancmasından on yeddi iz qalmışdır, lakin o, buna baxmayaraq, namazını kəsməmişdir.

**Əl-Buxarinin əla yaddaşı**

Allahın ona hələ uşaqlıq çağlarında gözəl yaddaş verməsi gözə çarpırdı. Xaşid bin İsmail aşağıdakıları nəql etmişdir: "Bəsrədə Əbu Abdullah Muhəmməd bin İsmail əl-Buxari, hələ gənc ikən, bizimlə birlikdə hədis biliciləri olan müxtəlif şeyxlərin görüşünə gedərdi və heç vaxt qeydlər aparmazdı. Bir neçə gün sonra biz ona deməyə başladıq ki: "Sən bizimlə müxtəlif şeyxlərin görüşünə gedirsən, amma heç nə qeyd etmirsən, niyə belə edirsən?" On altı gündən sonra o bizə dedi: "Siz, həqiqətən, çox danışır və mənə irad tutursunuz! Göstərin mənə, nə yazmısınız". Biz də on beş mindən çox hədis qeyd etdiyimiz vərəqlərimizi çıxartdıq, o isə bunların hamısını əzbərdən deməyə başladı və biz isə onun yaddaşına əsasən oxuduqları ilə öz qeydlərimizdə düzəlişlər etdik. Sonra o soruşdu: "Siz indidəmi hesab edirsiniz ki, mən müxtəlif şeyxlərə zarafat xatirinə baş çəkir və vaxtımı hədər yerə sərf edirəm?" – və bundan sonra bizə məlum oldu ki, yaddaşda heç kim onu ötüb keçə bilməz".

İmam əl-Buxari hələ gənc olduğu zamanlarda, hədis dinləmək istəyən bəsrəlilər, istədiklərinə nail olana qədər onun ardınca düşər, onu hər hansı bir yolun üstündə oturdar və ətrafına minlərlə dinləyici yığışardı, onların əksəriyyəti onun, o zaman bığsız gənc olmasına baxmayaraq, dediklərini yazardılar.

İmam əl-Buxarinin gözəl yaddaşa malik olması və mütləq dəqiqliklə fərqlənməsinə bir sübut da onun bir dəfə Səmərqəndə gələrkən dörd yüz nəfər hədis bilicisi ilə görüşməsidir. Onlar öz aralarında Şamdan və İraqdan olan hədislərin isnadını və rəvayətçilərin adlarını qarışdıraraq, bəzi hədislərin isnadını başqalarının mətninə qatdılar və bunların hamısını əl-Buxariyə oxudular. O isə hansı isnadın əslində hansı mətnə aid olduğunu bir-bir göstərdi və onları müvafiq qaydada düzdü və orada olanlardan heç kim heç bir isnadda və ya mətndə bir yanlışlıq tapa bilmədi. Belə bir şey Bağdadda da olmuşdu. Xəbər verilir ki, o, kitabı bir dəfə oxuduqda, onun məzmununu əzbərləyirdi, belə xəbərlər çoxdur.

**Əl-Buxarinin ən məşhur şeyxləri**

İmam əl-Buxari getdiyi müxtəlif ölkələrdə görüşdüyü mindən çox şeyxdən eşitdiyi hədisləri rəvayət etmişdir. Burada onun şeyxləri şagirdlərinin nəinki hamısı haqqında danışmaq, hətta onların sadəcə olaraq adlarını çəkmək belə mümkün deyil. Ona görə, biz onlardan ən məşhur olanları xatırlamağa məcbur olacağıq.

İmam əl-Buxarinin ən məşhur şeyxləri sırasına Həmməd bin Şakir, Tahir bin Məhlid, imam Əhməd bin Hənbəl, Əli ibn Mədini, Məkki ibn İbrahim əl-Bəlxi, Abdullah bin Musa əl-Əbsi, Əbu Bəkr əl-Humeydi, İbrahim bin Makil, Əbu Təlhə bin Əli əl-Baradi ən-Nəsəfi, İbrahim bin əl-Munzir, Adəm bin İyas, Abdan bin Osman əl-Mərvəzi, Əbu Asim əş-Şeybani və Yəhya bin Məin.

**Alimlərin imam əl-Buxari haqqında rəyləri**

İmam əl-Buxarinin müasirləri olmuş alimlərin böyük əksəriyyəti onu tərifləmişlər. Demək kifayətdir ki, hədis elmi sahəsində o, möminlərin əmiri ləqəbinə layiq görülmüşdür ki, bu heç kim tərəfindən inkar edilməmişdir. Bir dəfə imam Müslim imam əl-Buxarinin alnından öpərək ona demişdir: "Ey müəllimlərin müəllimi, mühəddislərin ağası və hədis qüsurlarının həkimi, icazə ver ayaqlarından öpüm" və bundan sonra, görüşə[1] görə günahların bağışlanması haqqında hədisə dair bir sual vermişdi və əl-Buxari də ona bu hədisin qüsurlarını göstərmişdi. O izah edib qurtardıqdan sonra, Müslim ona demişdi: "Ancaq paxıl adamlar sənə nifrət edə bilər! Şahidlik edirəm ki, bu dünyada sənə bənzəri olan yoxdur!"

Bundər demişdir: "Ən yaxşı mühəddis dörd nəfərdir: Reyli Əbu Zura, Nisaburlu Müslim, Səmərqəndli əd-Darimi və Buxaralı əl-Buxari". İmam Əhməd demişdir: "Xorasanda hələ onun bənzəri olmamışdır". Əli ibn Mədini demişdir: "Əl-Buxari heç vaxt özünə bənzərinə rast gəlməmişdir". İshaq bin Rahəviyə demişdir: "Əgər o Həsənin[2] zamanında da yaşasa idi, insanların onun hədislərinə, onun biliklərinə, onun fiqhi bilməsinə hökmən ehtiyacı olardı". Əbülabbas əd-Dələvi rəvayət etmişdir ki, Bağdad camaatının əl-Buxariyə məktubunda belə sözlər yazılmışdı: "Sən onlarla olduqca xeyir müsəlmanları tərk etməz. Səndən sonra yaxşısı tapılmaz, sənin yerin həmişə hiss olunacaq". Əbu Hatim ər-Razi demişdir: "Həqiqətən, o, Bağdada gələnlərin ən bilicisi idi". İbn Xuzeymə demişdir: "Göy qübbəsi altında Allahın Elçisinin ﷺ hədisləri haqqında əl-Buxaridən daha məlumatlı nə bir adam, nə də daha çox hədis yadda saxlayan görmüşəm". Ət-Tirmizi demişdir: "Mən nə İraqda, nə də Xorasanda tarixi əl-Buxaridən daha yaxşı bilən, hədislərin və onların isnadlarının qüsurlarını araşdıran görmədim".

---

[1] Burada keçirilən görüş zamanı Allahın adının çəkilməməsi və danışıqların boş danışıqlar olması nəzərdə tutulur. Rəvayət edilir ki, möminlərin anası Aişə demişdir: "Allahın Elçisi ﷺ kiminləsə görüşəndə, ya Quran oxuyar, ya da namaz qılardı, axırda isə o, mütləq deyərdi: "Şükr Sənə, ey Allahım, həmd olsun Sənə, şahidlik edirəm ki, Səndən başqa ilah yoxdur, Səndən bağışlanma diləyirəm və Sənə tövbə edirəm (Subhanəkə, Allahummə və bihəmdikə, əşhədu ən lə ilahə illə Əntə, əstəğfirukə və ətubu iləykə)".

[2] Burada ən görkəmli tabeinlərdən biri olan əl-Həsən əl-Bəsri (728 – 842) nəzərdə tutulur. O, öz müasirlər arasına çox böyük nüfuza malik idi.

### Əl-Buxarinin ən mühüm və ən məşhur əsərləri

İmam əl-Buxari özündən sonra çoxsaylı əsərlər qoymuşdur ki, onlardan ən mühüm və ən çox geniş yayılmışı "əl-Cami əs-Səhih"-dir. Bundan başqa onun əsərləri sırasına "əl-əsma vəl-Kuna", "ət-Tarix əl-Kəbir", "əs-Sünən fil-Fiqh", "Xalqu Əfalil-İbad", "əl-Ədəb əl-Mufrəd" və "Əl-Qiraə Xəlfəl-İmam" kimi kitabları daxildir.

### Bu külliyyatın tərtib olunmasına səbəb nə olmuşdur

İmam əl-Buxarini, ancaq səhih hədislərin daxil edildiyi "Səhih"ini tərtib etməyə vadar edən əsas səbəb, onun müasirləri tərəfindən hazırlanan toplulara səhih hədislərlə yanaşı zəif hədislərin də salınması idi. Bu imam əl-Buxarinin xoşuna gəlmirdi. Çünki o, öz şeyxi İshaq ibn Rahaveyhin təkcə səhih hədisləri bir yerə toplamaq istəyini və şagirdlərini buna sövq etdiyini və belə dediyini unutmamışdı: "Əgər Allahın elçisinin ﷺ qısa hədislər külliyyatını tərtib etsəydiniz çox əla olardı". Bu sözlər imam əl-Buxarinin qəlbinə yer etmişdi və bundan sonra o, öz "Səhih"inə materiallar yığmağa başlamışdı.

Bundan başqa, özünü Allahın elçisinin ﷺ qarşısında əlində yelpiklə dayandığını və onu mühafizə etdiyini gördüyü yuxunun - əl-Buxarinin, Allahın Elçisini ﷺ yalanlardan qoruyacağı kimi yozulması, onun qərarını qətiləşdirmişdi. Bütün yuxarıda xatırlananlar onu bu əsərlə ciddi məşğul olmağa yönəltmiş və nəticədə o, böyük imamın əsərlərinin ən yaxşısı olaraq, imamın yüksək məqamına dəlalət etmiş və İslam dininə böyük xidmət göstərmişdir. İşin gedişatında imam əl-Buxari təxminən altı yüz min hədisi yoxlamış və onun yaratdığı əsər, Qüdrətli və Böyük Allahın Kitabından sonra, ən yaxşı kitab olmuşdur ki, bu da, tərtib olunduğu gündən sonra onu qəbul edən və bu günədək yüksək qiymətləndirən müsəlman millətinin yekdil rəyinə tam uyğundur. İmam əl-Buxari öz kitabı üzərində on altı il ərzində işləmişdir.

İmam əl-Buxari ömrünün sonunda öz şəhərindən, o zamanlar Səmərqəndin bir kilometrliyində yerləşən Xərtənk kəndinə köçdü. O orada öz yaxınlarının arasında yaşayaraq Allahdan onu Öz yanına aparmasını diləyirdi, çünki onu, Peyğəmbərin ﷺ Allaha tez-tez müraciət edərək qorunmasını istədiyi qarşıdakı qarışıqlıqlar və hərcmərcliklər qorxudurdu.

Bu müraciətlərdən bir müddət sonra o xəstələndi və şənbə günü ramazan bayramı gecəsi, axşam namazı başlayandan sonra 256-cı hicri ilində vəfat etdi. Onun cənazə namazı səhəri gün zöhr namazından sonra qılındı. Allah ona rəhmət etsin və ondan razı olsun!

### Əl-Buxarinin "Səhih"i ilə tanışlıq

Əbu Abdullah əl-Buxari öz kitabını "Əl-Cami əl-Müsnəd əs-Səhih əl-Muxtəsər min umuri Rasulillah və Sünənihi və Əyyamihi" adlandırmışdır. Bu əsərin tutduğu

yerə gəldikdə isə, alimlər deyiblər ki, əl-Buxarinin kitabında ilk dəfə olaraq ancaq səhih olan hədislər bir yerə toplanıb mövzular üzrə təsnifləşdirilmişdir.

Bundan başqa, alimlər belə bir rəydə yekdil olublar ki, bu prinsip üzrə tərtib edilmiş bütün toplulardan ən etibarlı hədislər Buxari və Müslimin "Səhih"lərinə daxil edilənlərdir. Alimlərin əksəriyyəti belə hesab edir ki, Buxarinin "Səhih"i Müslimin "Səhih"indən daha mötəbərdir və faydalıdır. Hərçənd Əbu Əli Nisaburi Müslimin "Səhihini" daha mötəbər saymışdır, habelə məğrib alimləri də bu nəzər nöqtəsinin tərəfdarı olmuşlar, lakin bununla razılaşmaq olmaz, çünki əslində üstünlük Buxarinin "Səhih"inə verilməlidir. İmam Əbu Bəkr əl-İsmaili özünün "Əl-Mədxəl" adlı əsərində Buxarinin "Səhih"ini Müslimin "Səhih"indən üstün tutur və öz nəzər nöqtəsini müvafiq dəlillərlə əsaslandırır.

İmam ən-Nəvəvi demişdir: "Bizə nəql ediblər ki, imam Əbu Abdur-Rəşid ən-Nəsai deyib: "Bu kitabların arasında Buxarinin kitabından yaxşısı yoxdur".

Bil ki, bu hər iki kitabın səhihliyi alimlərin yekdil rəyidir. Bu isə o deməkdir ki, onlarda verilmiş hədislərin həyata tətbiq edilməsi vacibdir.

İmam ən-Nəvəvi demişdir: "Bir neçə yolla bizə rəvayət edilmişdi ki, Buxari belə deyib: "Mən altı yüz min hədisdən seçdiyim "Səhih" üzərində on altı il müddətində işləmişəm və onu, Qüdrətli və Böyük Allah qarşısında özümə bəraət qazanmaq üçün etmişəm". Yenə imam əl-Buxari demişdir: "Bir dəfə yuxuda gördüm ki, əlimdə yelpik Peyğəmbərin ﷺ qarşısında dayanmışam və onu mühafizə edirəm. Bundan sonra mən bir sıra yuxu yozanlardan bu barədə soruşdum və onların hamısı: "Sən onu yalanlardan qoruyursan" dedilər ki, bu da məni "Səhih"i tərtib etməyə sövq etdi".

Rəvayət edilir ki, Buxari demişdir: "Mən öz "əl-Cami" əsərimə yalnız səhih hədisləri daxil etmişəm. Lakin kitabın həcminin böyüklüyünə görə onların bir hissəsini ona daxil etmədim.

Yenə imam əl-Buxari demişdir: "Mən qüsl alıb iki rükət namaz qılmadan bir hədisi belə öz "Səhih"imə yazmamışam".

Abdul-Quddus bin Həmmam demişdir: "Mən müxtəlif şeyxlərdən eşitmişəm ki, əl-Buxari Peyğəmbərin ﷺ qəbri ilə minbəri arasında "Səhih"inin fəsillərinin məzmununa izahını tərtib edər və bundan öncə isə iki rükət namaz qılarmış".

İmam ən-Nəvəvi demişdir: "Bu kitabı Buxarinin dilindən doxsan min nəfər dinləmişdir".

İmam və fiqh alimi Əbu Zeyd Muhəmməd bin Əhməd Muhəmməd əl-Mərvəzi demişdir: "Bir dəfə mən Peyğəmbəri ﷺ yuxumda gördüm və o mənə dedi: **"Doğrusu, ümmətim fiqh öyrənir, amma mənim kitabımı öyrənmir".** Mən soruşdum ki, ey Allahın Elçisi, sən nəyə "mənim kitabım" deyirsən?" Sualıma: **"Muhəmməd bin İsmail əl-Buxarinin "Camisini"** və yaxud buna bənzər bir cavab verdi".

Əbu Abdullah Muhəmməd bin Əli demişdir: "Mən Muhəmməd bin İsmail belə deyərkən eşitdim: "Mən Bəsrədə öz kitablarım üzərində işləyərək beş il yaşadım.

Hər il həccə gedir və sonra Məkkədən Bəsrəyə qayıdırdım və mən əminəm ki, Allah bu əsərləri müsəlmanlar üçün bərəkətli edəcəkdir".

Əbu Abdullah demişdir: "Allah da onları mübarək etmişdir".

Bəkr bin Munir demişdir: "Bir dəfə Buxaranın hökmdarı əmir Xalid bin Əhməd əz-Zuhəli bir nəfəri Muhəmməd bin İsmail əl-Buxarinin yanına göndərmişdi ki, o, ona desin: "Cami", "Tarix" və digər kitablarını mənə göndər və mən sənin onlarda nə yazdığını özündən eşidim". Buna cavab olaraq əl-Buxari onun göndərdiyi adama belə dedi: "Doğrusu, mən elmi alçaltmıram və onu adamların qapısına göndərmirəm, əgər sənin bunlardan bir şeyə ehtiyacın varsa, özün ya mənim məscidimə, ya da evimə gəl".

Rəvayətin İbn Munir tərəfindən nəql edilən variantında deyilmişdir: "Əmir imam əl-Buxarinin dalınca adam göndərmişdi ki, o, gəlib ancaq onun uşaqlarına hədis öyrətsin və bu zaman heç kim orada iştirak etməsin, lakin əl-Buxari bunu rədd edərək demişdi: "Məni dinləmək üçün bəzilərini seçib, başqalarını kənarda qoya bilmərəm".

**"Səhih"dəki hədislərin sayı**

"Səhih"də isnadla təchiz edilmiş hədislərin, o cümlədən təkrarlanan hədislərin sayı yeddi min iki yüz yetmiş beşdir, amma təkrarlananlar nəzərə alınmadan, təxminən dörd mindir.

**Təkrarlanan hədislərin səbəbi**

Bil ki, Buxari müxtəlif elmləri və Sünnənin bütün incəliklərini dərk etməyə can ataraq, yüksək məqsədlər barədə düşünürdü. Çətin ki, kimsə onunla bu məsələdə müqayisə edilə bilər. Dediyimizin təsdiqi kimi, Buxarinin şeyxləri sırasından adlarını çəkdiyimiz görkəmli hədis bilicilərinin və başqa adamların onun haqqında yuxarıda qeyd etdiyimiz rəyləridir və əgər sən onun kitabı ilə tanış olsan səndə bu barədə qətiyyən heç bir şübhə yeri qalmaz. İmam əl-Buxari öz vəzifəsini ancaq təkcə hədisləri toplamaqla və mətinləri verməklə məhdudlaşdırmır, o daha irəli gedərək, hədislərdən nəticələr çıxarır[1] və onları dinin əsaslarına və qollarına, dünyanın tərkinə, əxlaq tərbiyəsinə və buna bənzər şeylərə həsr etdiyi fəsillərdə dəlil kimi istifadə edir.

Elə buna görə də Buxari "Səhihin" bəzi fəsillərində hədislərin isnadını vermədən, "Peyğəmbər ﷺ demişdir, deyə rəvayət edən filan səhabənin sözlərindən" və ya "filankəsin sözlərindən rəvayət edilən hədisdə bu barədə belə deyilmişdir" kimi ifadələrlə kifayətlənir.

---

[1] Burada söhbət şəriətin əsas mənbələrindən, birbaşa nəzərdə tutulmamış hallar üçün, hüquqi (fiqhi) hökmlərin çıxarılmasından gedir.

Bundan başqa, hədislərin isnadlarının əvvəlində bir və ya bir-neçə ravinin adı çox vaxt buraxılır. Hədislərin bu tərzdə verilməsi "təliq"[1] adlanır. İmam əl-Buxari hər hansı bir şeyi dəlil kimi istifadə etmək istədikdə, hədisin bütövlükdə verilməsinə və ya isnadının, ya da mətninin verilməsinə ehtiyac duymadığı hallarda bu üsula müraciət edir. Belə hallarda o, özünün bundan xeyli vaxt əvvəl və ya bir qədər öncə gətirdiyi hədislər sırasına aid çox məşhur olan müvafiq hədisləri göstərir. "Səhihin" fəsillərinin məzmununa dair öz izahlarını verərkən, əl-Buxari Müqəddəs Qurandan çoxsaylı ayələr verir, amma bəzi hallarda bir-neçə ayədən istifadə edərək heç bir şərhə yol vermir. Fəsillərə şərh verdiyi zaman əl-Buxari həmçinin çoxlu başqa şeylərdən, o cümlədən əshabələrin və onların ardıcıllarının və habelə onları əvəz edənlərin fitvalarından[2] istifadə edir.

Yuxarıda xatırladıqlarımızın hamısı dediklərimizin düzgünlüyünün təsdiq edilməsində sənin üçün əsas olmalıdır və əgər sənə aydın olsa ki, Buxarinin məqsədi bizim yada saldıqlarımız imiş, onda sən başa düşərsən ki, müvafiq hallarda hədislərin təkrarlanmasında heç bir pis şey yoxdur. Fəqihlərdən[3] olan alimlər və dinin digər biliciləri də bunun tərəfdarları idi və onlar çoxsaylı müxtəlif fəsillərdə verilmiş hədislərdən dəlil kimi istifadə edirdilər.

İmam ən-Nəvəvi rəvayət etmişdir ki, Abul-Fədl əl-Məqdisi demişdir: "İmam əl-Buxari eyni hədisi müxtəlif yerlərdə tez-tez istifadə edir və sonra da özünün (*hökm*) çıxarmaq qabiliyyətinə və dərin düşüncəsinə əsaslanaraq ondan müvafiq fəslin məzmununa uyğun olan şeylər çıxarır. Bununla yanaşı o, eyni hədisin eyni variantını bir isnadla iki ayrı-ayrı yerdə çox nadir hallarda verir. Belə hədisi verdikdə, onu digər bir əshabənin, tabiinin və ya hər hansı bir başqa ravinin variantı ilə yazır ki, həmin hədisin daha etibarlı olmasını belə çoxsaylı ötürülmələrlə və ya onun başqa versiyasından və yaxud rəvayətçilərinin sayının fərqləndirilməsi ilə və yaxud da ki, hər hansı başqa bir üsulla gücləndirsin. Bunun ən yaxşısını bilən Allahdır".

*Allah imam əl-Buxariyə rəhmət etsin*
*və onun əsərlərinə görə onu mükafatlandırsın!*

[1] "Təliq" sözü (sallamaq, asmaq) "alləqə" felindən törənmişdir ki, bu da bir şeyi başqa bir şeydən asmaq mənasını bildirir. Bu növ isnadları "asılmış" isnad adlandırırdılar, çünki onlar ancaq hədisin yuxarı hissəsi ilə bağlı olur, aşağı hissəsi ilə əlaqədə olmur və bu da onları tavandan və ya hər hansı bir şeydən asılmışa bənzədir.

[2] Fitva – səlahiyyətli şəxsin dini-hüquqi məsələ üzrə çıxardığı qərardır.

[3] Fəqih – dini-hüquqi məsələlər üzrə qərar çıxarmaq haqqı olan şəriət qanunvericisidir.

# *İmam əz-Zəbidi haqqinda qısa məlumat*

Görkəmli hədis alimi Əbul-Abbas Zeynəddin Əhməd bin Əhməd bin Abdul-Lətif əş-Şərci əz-Zəbidi, zamanına görə Yəmənin ən yaxşı mühəddisi, alim və bir sıra əsərlərin müəllifi, Yəmənin yaxınlığında yerləşən Zəbid[1] şəhərinin Şərcə kəndində hicri 812-ci il ramazan ayının on ikisində cümə günü anadan olmuş və hicri 893-cü ilin rəbiəlaxir ayının doqquzunda Zəbid şəhərində vəfat etmişdir. Çoxsaylı alimlərin həyatı və fəaliyyəti, əl-Məmunun[2] xəlifəliyi dövründə əsası qoyulmuş bu şəhərlə bağlıdır.

Onun əsərləri arasında "Təbəqat əl-Həvəs", "əl-Fəvaid Fissalət vəl-Əvaid", "Nuzhət əl-Əlbab", "əl-cavab əş-Şafi fir-rədd ələl-mubtadi əl-Cafi" və həmçinin "ət-təcrid əs-Sərih li-Əhadis əl-Cami əs-Səhih" xüsusi yer tutmuşdur.

Yuxarıda qeyd olunan əsərlərin sonuncusu əl-Buxari "Səhih"inin qısaldılmış variantı olduğu halda, səhvən Hüseyn ibn Mübarək əz-Zəbidinin adına çıxılmışdır. Lakin Zəbiddə anadan olmuş Hüseyn ibn Mübarək bin Muhəmməd bin Yəhya bin Müslim bin İmran ər-Rəbi Bağdadda yaşamışdır və hənbəli məzhəbində olmuşdur. O, Bağdadda, Dəməşqdə və Hələbdə hədis rəvayət etmiş və onun sözlərindən bu hədisləri çoxsaylı məşhur mühəddislər, o cümlədən əd-Dəbisi və əd-Diya nəql etmişlər. Hüseyn ibn Mübarək əz-Zəbidi hicri 631-ci ildə Bağdadda vəfat etmişdir. Yenə, Əbu Əli əl-Hüseyn ibn Mübarək adlanan bir əz-Zəbidi Əbu Hənifə məzhəbinin ardıcıllarından və Əbül-Vəqtənin şagirdi idi. O, Baqdadda yaşamış və hicri 629-cu ildə orada vəfat etmişdir.

Allah imam əz-Zəbidiyə və yuxarıda adları çəkilən bütün alimlərə İslam və müsəlmanların naminə etdiklərinə görə kömək olsun!

---

[1] İmamın nisbəsi şəhərin adına deyil, Yəmən qəbiləsi zubayd adına aiddir.
[2] Əl-Məmun (813 - 833) Abbasilər sülaləsinin xəlifəsi.

## *Mərhəmətli və Rəhimli Allahın adı ilə*

## *İmam əz-Zəbidinin ön sözü*

Həmd olsun Allaha, xəlq edənə, surət verənə, yaradana, bəxş edənə, qələbə çalana və nemət verənə, qulları qazanmadan öncə onlara lütfkarlıq edənə! İnsanlara onların ləyaqətli əxlaqi keyfiyyətlərini kamilləşdirməsi üçün göndərdiyi, yaratdığı bütün məxluqatdan istisnasız olaraq üstün tutduğu və buna görə də hamını geridə qoymuş elçisinə, onun itaətindən çıxmayan nəcib ailə üzvlərinə və əshabələrinə Allahın salavatı və salamı olsun!

Sonra isə, bil ki, böyük və öz sahəsində yeganə imam və mühəddislərin mühəddisi olan Əbu Abdullah Muhəmməd bin İsmail bin İbrahim əl-Buxarinin "əl-Cami əs-Səhih" kitabı İslam dininin ən mühüm və faydalı kitabları sırasına daxildir. Lakin onda təkrarlanan hədislər müxtəlif fəsillərə səpələnmişdir və bu və ya digər bir hədisi tapmaq istəyən adam həmin hədisi tapmaqdan ötrü bütün fəsillər arasında kifayət qədər uzun müddət axtarış aparmalı və bu axtarışa çox vaxt sərf etməlidir. Toplunu belə bir prinsip üzrə tərtib edən Buxari göstərmək istəmişdir ki, hər hansı bir səhih hədis müxtəlif yollarla nəql edilmiş və geniş istifadə edilmişdir. Amma bizim məqsədimiz isə ondan ibarətdir ki, "Səhih"də toplanmış hədislərin mötəbərliyini nəzərə alaraq, hədisin əsasını verək.

Müslimin "Səhih"inin şərhçisi imam ən-Nəvəvi, öz şərhinə ön sözündə yazırdı: "Buxariyə gəldikdə isə, o, hədislərin müxtəlif variantlarını ayrı-ayrı və bir-birindən uzaq fəsillərdə və çox vaxt, ilk nəzərdə uyğun olan fəsillərdə deyil, tamam başqa bir fəsildə yerləşdirmişdir ki, bunun da nəticəsində həmin hədisin rəvayət edilmə yolları haqqında təsəvvür əldə etmək istəyən üçün bu böyük çətinlik törədir".

O həmçinin yazırdı: "Mən bir-neçə nüfuzlu mühəddislər görmüşəm ki, onlar Buxari tərəfindən həmin hədislərin, həqiqətən onun "Səhih"ində verilməsinə baxmayaraq, rəvayət edilməsini inkar edərək təhrifə yol verirdilər. Onlar bu hədisləri tamam başqa yerdə axtardıqlarına görə bu yanlışlığa yol verirdilər".

Məhz buna görə məndə belə bir arzu yarandı ki, Buxarinin hədislərini təkrarlamadan, isnadlarını vermədən yenidən tərtib edim və bunu belə də etdim ki, hər hansı hədisin istifadə edilməsi imkanı mümkün qədər asanlaşsın. Bir qayda olaraq, mən təkrarlanan hədisi ancaq bir dəfə qeyd edirəm, onun gətirildiyi başqa yerdə hər hansı faydalı bir əlavə olduqda isə, onları da ayrıca qeyd edirəm, halbuki başqa hallarda buna yol vermirəm. Mənim ilk rast gəldiyim hədis əsas hədisin ixtisar edilmiş forması olduqda, ikinci dəfə isə onun daha tam forması ilə rastlaşdıqda, ikinci hədisi verir və daha çox fayda əldə edilməsi üçün birincinin üstündən keçirəm.

Mən burada tam isnadla olan hədisləri verirəm. Əgər hədisdə tabiinlərdən hansı birisinin dediyi və ya etdiyi barədə rəvayət olunursa, yaxud hədisin isnadında buraxılış olursa, onu topluya qeyd etmirəm. Bu, eynilə əshabələrin və daha sonrakı

dövrlərdə yaşayan ardıcılların rəvayətlərinə də aiddir: onlar hədisin məzmunu ilə bağlı olmadıqda və onlarda Peyğəmbər ﷺ haqqında xatirə verilmədikdə, mən onları kitaba yazmıram. Məsələn: Əbu Bəkr ilə Ömərin piyada Bəni Səid qəbiləsinin talvarına getməsi və ənsarın nümayəndələri ilə söhbət etmələri haqqında hekayəti götürmədim. Ömərin öldürülməsi və onun Peyğəmbərin ﷺ və Əbu Bəkrin yanında basdırılmasına icazə verməsi üçün Aişəyə müraciət etməsi ilə bağlı oğluna vəsiyyəti haqqında hekayətlər də verilməmişdir. Bu hekayətdə onun şura[1] haqqında dedikləri və Osmana beyət gətirmələri haqqında xəbər verilir. Eynilə Zubeyrin onun borcunu ödəməsi barədə oğluna vəsiyyəti haqqında hekayət və buna bənzər başqa xəbərlər kitaba salınmamışdır.

Daha sonra, hər hədisdə mən onu rəvayət edən əshabənin adını çəkirəm ki, bu hamıya məlum olsun və əksər hallarda Buxarinin istifadə etdiyi ifadələrdən yararlanıram.

Bu mübarək kitabı "ət-Təcrid əs-Sərih li-Əhadis əl-Cami" ("Aydın ifadə edilmiş hədislərin mötəbər toplusu") adlandıraraq Uca Allahdan rica edirəm ki, onu faydalı etsin, çünki o, yalnız Allah xatirinə tərtib edilmişdir. Qoy Allah mənim məqsədimi və işlərimi yoluna qoysun!

İndi isə vaxt yetişibdir, Uca Allahın razılığı ilə başlayaq.

[1] 644-cü ildə Ömər ؓ ölümcül yaralandıqdan sonra, o, şura üzvləri yaradılması üçün əshabələrdən altı nəfərin adını çəkmişdi ki, onlardan arasından xəlifə seçilməli idi.

# ١ – كتابُ بَدْءِ الوَحْيِ إِلَى رَسُولِ اللهِ ﷺ

# 1 – Peyğəmbərə ﷺ gələn vəhyin başlanğıcı kitabı

## ١– باب: كَيْفَ كَانَ بَدْءُ الْوَحْيِ إِلَى رَسُولِ اللهِ ﷺ

## 1-ci fəsil. Peyğəmbərə ﷺ gələn vəhyin[1] başlanğıcı necə olmuşdur?

١ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رضي الله عنه قَالَ: سَمِعْتُ رَسُولَ اللهِ ﷺ يَقُولُ: «إِنَّمَا الأَعْمَالُ بِالنِّيَّاتِ، و إِنَّمَا لِكُلِّ امْرِئٍ مَا نَوَى، فَمَنْ كَانَتْ هِجْرَتُهُ إِلَى دُنْيَا يُصِيبُهَا، أَوْ إِلَى امْرَأَةٍ يَنْكِحُهَا فَهِجْرَتُهُ إِلَى مَا هَاجَرَ إِلَيْهِ» [رواه البخاري: ١]

**1.** Ömər ibn Xəttab رضي الله عنه rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Əməllər ancaq niyyətlərə görədir. Hər kəsə də yalnız niyyət etdiyi şey qalacaqdır. Kim hicrəti[2] əldə edəcəyi dünya (malından) və ya evlənəcəyi qadından ötrü etmişsə, onun hicrəti (Allah və Onun peyğəmbərinin ﷺ razı qalması üçün deyil), hicrət etdiyi şeyə aiddir". (əl-Buxari, 1)

٢ – عَنْ عَائِشَةَ أُمِّ الْمُؤْمِنِينَ رضي الله عنها: أَنَّ الحَارِثَ بْنَ هِشَامٍ سَأَلَ رَسُولَ اللهِ ﷺ فَقَالَ: يَا رَسُولَ اللهِ، كَيْفَ يَأْتِيكَ الْوَحْيُ؟ فَقَالَ رَسُولُ اللهِ ﷺ «أَحْيَاناً يَأْتِينِي مِثْلَ صَلْصَلَةِ الْجَرَسِ وَ هُوَ أَشَدُّهُ عَلَيَّ، فَيَفْصِمُ عَنِّي وَ قَدْ وَعَيْتُ عَنْهُ مَا قَالَ، وَ أَحْيَاناً يَتَمَثَّلُ لِيَ الْمَلَكُ رَجُلاً، فَيُكَلِّمُنِي فَأَعِي مَا يَقُولُ»
قَالَتْ عَائِشَةَ رضي الله عنها: وَ لَقَدْ رَأَيْتُهُ يَنْزِلُ عَلَيْهِ الْوَحْيُ فِي الْيَوْمِ الشَّدِيدِ الْبَرْدِ، فَيَفْصِمُ عَنْهُ وَ إِنَّ جَبِينَهُ لَيَتَفَصَّدُ عَرَقاً.
[رواه البخاري: ٢]

**2.** Möminlərin anası Aişə رضي الله عنها rəvayət edir ki, Haris ibn Hişam Peyğəmbərdən ﷺ soruşdu: "Ey Allahın elçisi! Sənə vəhy necə gəlir?" Peyğəmbər ﷺ buyurdu: "Bəzən (vəhy) mənə zınqırovun cingiltisi kimi gəlir və mənə ən ağır gələni də elə budur. Bu hal məndən çəkilən kimi (mələyin) mənə söylədikləri yadımda möhkəm qalırdı. Bəzən də mələk mənə kişi qiyafəsində görünür, mənimlə danışır, mən də onun söylədiyini yadda saxlayıram".

Aişə رضي الله عنها demişdir: "Mən çox soyuq bir gündə Allahın elçisinə ﷺ vəhy nazil olduğunu görmüşəm. Bu hal ondan çəkilərkən alnından tər axırdı". (əl-Buxari, 2)

٣ – عَنْ عَائِشَةَ أُمِّ الْمُؤْمِنِينَ رضي الله عنها قَالَتْ: أَوَّلُ مَا بُدِىءَ بِه رَسُولُ اللهِ ﷺ مِنَ الْوَحْيِ الرُّؤْيَا الصَّالِحَةُ فِي النَّوْمِ فَكَانَ لاَ يَرَى رُؤْيَا إِلاَّ جَاءَتْ مِثْلَ فَلَقِ الصُّبْحِ ثُمَّ حُبِّبَ إِلَيْهِ الْخَلاَءُ فَكَانَ يَخْلُو بِغَارِ حِرَاءِ فَيَتَحَنَّثُ فِيهِ – وَهُوَ التعبد – اللَّيَالِيَ ذَوَاتِ الْعَدَدِ قَبْلَ أَنْ يَنْزِعَ إِلَى أَهْلِهِ وَيَتَزَوَّدُ لِذَلِكَ ثُمَّ يَرْجِعُ إِلَى خَدِيجَةَ فَيَتَزَوَّدُ لِمِثْلِهَا حَتَّى جَاءَهُ الْحَقُّ وَهُوَ

---

[1] Gizli danışıq, işarə etmə, əmr etmə, ilham vermə, pıçıldama, məktub yazma, elçi göndərmə, tələsdirmə, səs çıxarma. Uca Allahın bilavasitə və ya başqa Özünəməxsus üsullarla Öz əmrlərini peyğəmbərlərinə bildirməsi mənasında işlədilən bir Quran istilahıdır.

[2] Hicrət sözü aşağıdakı mənaları verir:

(a) müsəlmanın dinini qorumaq məqsədilə İslama düşmənçilik edən ölkədən təhlükəsiz yerə köçməsi; (b) Muhəmməd Peyğəmbərin ﷺ əshabələrinin əvvəlcə Həbəşistana (indiki Efiopiyaya), sonra da Mədinəyə köçməsi; (c) Muhəmməd Peyğəmbərin ﷺ Məkkədən Mədinəyə köçməsi; (ç) başlanğıcı xristian təqviminin 622-ci ilinə uyğun gələn müsəlman təqvimi.

فِي غَار حرَاء فَجَاءَهُ الْمَلَكُ فَقَالَ: اقْرَأْ، قَالَ: مَا أَنَا بقَارِئ، قَالَ: فَأَخَذَنِي فَغَطَّنِي حَتَّى بَلَغَ مِنِّي الْجهْدَ ثُمَّ أَرْسَلَنِي فَقَالَ: اقْرَأْ، قُلْتُ: مَا أَنَا بِقَارِئ، فَأَخَذَنِي فَغَطَّنِي الثَّانِيَةَ حَتَّى بَلَغَ مِنِّي الْجهْدَ ثُمَّ أَرْسَلَنِي فَقَالَ: اقْرَأْ فَقُلْتُ: مَا أَنَا بِقَارِئٍ، فَأَخَذَنِي فَغَطَّنِي الثَّالِثَةَ ثُمَّ أَرْسَلَنِي فَقَالَ: ﴿ٱقْرَأْ بِٱسْمِ رَبِّكَ ٱلَّذِى خَلَقَ ﴿١﴾ خَلَقَ ٱلْإِنسَـٰنَ مِنْ عَلَقٍ ﴿٢﴾ ٱقْرَأْ وَرَبُّكَ ٱلْأَكْرَمُ ﴿٣﴾ ٱلَّذِى عَلَّمَ بِٱلْقَلَمِ ﴿٤﴾ عَلَّمَ ٱلْإِنسَـٰنَ مَا لَمْ يَعْلَمْ ﴿٥﴾﴾ فَرجَعَ بهَا رَسُولُ الله ﷺ يَرْجفُ فُؤَادُهُ فَدَخَلَ عَلَى خَديجَةَ بنْت خُوَيْلد رضي الله عنها فَقَالَ: «زَمِّلُوني زَمِّلُوني» فَزَمَّلُوهُ حَتَّى ذَهَبَ عَنْهُ الرَّوْعُ، فَقَالَ لخَديجَةَ وَأَخْبَرَهَا الْخَبَرَ: لَقَدْ خَشيتُ عَلَى نَفْسِي فَقَالَتْ خَديجَةُ: كَلاَّ وَاللهِ مَا يُخْزِيكَ اللهُ أَبَداً، إِنَّكَ لَتَصلُ الرَّحِمَ، وَتَحْملُ الكَلَّ وَتَكسبُ الْمَعْدُومَ وَتَقْرِي الضَّيْفَ وَتُعِينُ عَلَى نَوَائب الْحَقِّ.

فَانْطَلَقَتْ به خَديجَةُ حَتَّى أَتَتْ به وَرَقَةَ بْنَ نَوْفَلِ بْن أَسَد بْن عَبْد الْعُزَّى بْنَ عَمِّ خَديجَةَ وَكَانَ امْرَأً تَنَصَّرَ فِي الْجَاهلِيَّة وَكَانَ يَكْتُبُ الْكِتَابَ الْعِبْرَانِيَّ، فَيَكْتُبُ منَ الإنْجيلِ بالْعِبْرَانيَّة مَا شَاءَ اللهُ أَنْ يَكْتُبَ وَكَانَ شَيْخاً كَبِيراً قَدْ عَمِيَ فَقَالَتْ لَهُ خَديجَةُ: يَا بْنَ عَمِّ، اسْمَعْ منِ بْنِ أَخِيكَ فَقَالَ لَهُ وَرَقَةُ: يَا بْنَ أَخِي، مَاذَا تَرَى؟ فَأَخْبَرَهُ رَسُولُ الله ﷺ خَبَرَ مَا رَأَى، فَقَالَ لَهُ وَرَقَةُ: هَذَا النَّامُوسُ الَّذِي نَزَّلَ اللهُ عَلَى مُوسَى، يَا لَيْتَنِي فِيهَا جَذَعاً، لَيْتَنِي أَكُونُ حَيّاً إِذْ يُخْرِجُكَ قَوْمُكَ، فَقَالَ رَسُولُ الله ﷺ: أَوَ مُخْرِجِيَّ هُمْ؟ قَالَ: نَعَمْ، لَمْ يَأْت رَجُلٌ قَطُّ بمِثْلِ مَا جِئْتَ به إِلاَّ عُودِيَ وَإِنْ يُدْرِكْنِي يَوْمُكَ أَنْصُرْكَ نَصْراً مُؤَزَّراً ثُمَّ لَمْ يَنْشَبْ وَرَقَةُ أَنْ تُوُفِّيَ، وَ فَتَرَ الْوَحْيُ. [رواه البخاري: ٣]

**3.** Möminlərin anası Aişə رضي الله عنها rəvayət edir ki, Allahın elçisinə ﷺ ilk vəhyin gəlməsi gözəl yuxu vasitəsilə başlamışdır. Onun gördüyü elə bir yuxu yox idi ki, sübh çağının aydınlığı kimi gerçək olmasın. Sonra onun qəlbinə tənhalığa çəkilmək meyli salındı. Peyğəmbər ﷺ Hira dağındakı[1] mağarada xəlvətə çəkilib, ailəsinin yanına qayıdanadək müəyyən gecələri orada ibadət edərdi. (O özü ilə azuqə götürüb xəlvətə çəkilərdi). Sonra Xədicənin yanına qayıdıb yenə bir o qədər müddət qalmaq üçün azuqə götürərdi. Nəhayət, Peyğəmbər ﷺ Hira dağındakı mağarada olarkən ona haqq nazil oldu. Mələk onun yanına gəlib: "Oxu!"– dedi. O isə: "Mən oxumağı bacarmıram!"– deyə cavab verdi.

(Peyğəmbər ﷺ) dedi: "O zaman mələk məni tutub taqətim kəsilənədək sıxdı, sonra da buraxıb: "Oxu!"– dedi. Mən də: "Oxumağı bacarmıram!"– dedim. O ikinci dəfə məni tutub nəfəsim kəsilənədək sıxdı, sonra da buraxıb: "Oxu!"– dedi. Mən isə: "Oxumağı bacarmıram!"– dedim. O üçüncü dəfə məni tutub nəfəsim kəsilənədək sıxdı, sonra da buraxıb dedi: **"Yaradan Rəbbinin adı ilə oxu! O, insanı qan laxtasından yaratdı. Oxu! Sənin Rəbbin *müqayisəsiz* səxavətə malikdir. O, qələmlə *yazmağı* öyrətdi. İnsana bilmədiklərini öyrətdi."**[2]

(Bu hadisədən sonra) Peyğəmbər ﷺ qorxudan ürəyi əsə-əsə həmin ayələrlə geri döndü. O, Xədicə bint Xuveylidin (evinə) daxil olub: "Üstümü örtün, üstümü örtün!"– dedi. Onun üstünü örtdülər. Nəhayət, qorxu ondan keçib getdi və Peyğəmbər ﷺ başına gələn hadisəni Xədicəyə xəbər verib dedi: "Mən başıma bir iş gələcəyindən qorxdum." Xədicə dedi: "Xeyr! Allaha and olsun ki, Allah səni heç vaxt rüsvay etməz. Çünki sən qohumluq əlaqələrini möhkəmləndirir, zəiflərin yükünü daşıyır, yoxsula pay verir, qonağa yaxşı baxır və haqq yolunda (insanlara) yardım edirsən."

---

[1] Bu dağ Məkkədən üç mil aralıda yerləşir.

[2] "əl-Ələq" surəsi, 1-5.

Xədicə Peyğəmbəri ﷺ əmisi oğlu Varaqa ibn Nofəl ibn Əsəd ibn Abdul-Uzzanın yanına gətirdi. O, cahiliyyət dövründə nəsrani[1] olmuş bir adam idi və ibranicə yazmağı bacarır, İncildən Allahın dilədiyi qədər (bəzi şeylər) yazardı. O artıq gözləri kor olmuş qoca bir kişi idi. Xədicə dedi: "Ey əmim oğlu! Qulaq as, gör qardaşın oğlu nə deyir!" Varaqa ondan: "Ey qardaşım oğlu! Sən nə görürsən?"– deyə soruşdu. Peyğəmbər ﷺ də gördüyü şeyləri ona xəbər verdi. Varaqa ona dedi: "O gördüyün, Allahın Musaya göndərdiyi sirrin sahibidir[2]. Kaş dəvət edəcəyin vaxt mən gənc olaydım! Kaş qövmün səni (yurdundan) qovacağı zaman sağ olaydım!" Peyğəmbər ﷺ soruşdu: "Məgər onlar məni qovacaqlar?" Varaqa dedi: "Bəli! Sənin gətirdiyinin bənzərini gətirən (Allahın dinini təbliğ edən) elə bir kişi olmayıb ki, onunla düşmənçilik etməsinlər. Əgər həmin (dəvət edəcəyin) günə qədər yaşasam, var gücümlə sənə kömək edəcəyəm." Lakin çox keçmədi ki, Varaqa vəfat etdi və bir müddət vəhy nazil olmadı. (əl-Buxari, 3)

٤ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ الأَنْصَارِيِّ رضي الله عنهما: وَ هُوَ يُحَدِّثُ عَنْ فَتْرَةِ الْوَحْيِ، فَقَالَ فِي حَدِيثِهِ: «بَيْنَا أَنَا أَمْشِي إِذْ سَمِعْتُ صَوْتاً مِنَ السَّمَاءِ، فَرَفَعْتُ رَأْسِي، بَصَرِي فَإِذَا الْمَلَكُ الَّذِي جَاءَنِي بِحِرَاءٍ جَالِسٌ عَلَى كُرْسِيٍّ بَيْنَ السَّمَاءِ وَالأَرْضِ، فَرُعِبْتُ مِنْهُ، فَرَجَعْتُ فَقُلْتُ: زَمِّلُونِي زَمِّلُونِي، فَأَنْزَلَ اللهُ تَعَالَى: ﴿يَٰٓأَيُّهَا ٱلۡمُدَّثِّرُ ۝١ قُمۡ فَأَنذِرۡ ۝٢ وَرَبَّكَ فَكَبِّرۡ ۝٣ وَثِيَابَكَ فَطَهِّرۡ ۝٤ وَٱلرُّجۡزَ فَٱهۡجُرۡ ۝٥﴾ فَحَمِيَ الْوَحْيُ وَ تَتَابَعَ» [رواه البخاري: ٤]

**4.** Cabir ibn Abdullah əl-Ənsari رضي الله عنهما vəhyin (müvəqqəti olaraq) kəsilməsindən danışarkən rəvayətində bunu da söyləmişdir: "(Peyğəmbər ﷺ) demişdir: "(Bir dəfə) mən yol gedərkən göydən səs eşitdim və başımı yuxarı qaldırdım. Bir də gördüm ki, Hira dağında yanıma gələn mələk göylə yer arasında olan kürsünün üzərində əyləşmişdir. Mən ondan qorxdum. (Evə) qayıdıb "Üstümü örtün, üstümü örtün!"– dedim. Uca Allah da: **"Ey *əbasına* bürünüb örtünmüş *peyğəmbər*! Qalx və *insanları* xəbərdar et! Təkcə Rəbbini uca tut! Geyimini təmiz saxla! Pis şeyləri tərk et!"**[3]– ayələrini nazil etdi. Sonra vəhy çoxaldı və bir-birinin ardınca nazil olmağa başladı. (əl-Buxari, 4)

٥ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما فِي قَوْلِهِ تَعَالَى: ﴿لَا تُحَرِّكۡ بِهِۦ لِسَانَكَ لِتَعۡجَلَ بِهِۦٓ﴾ قَالَ: كَانَ رَسُولُ اللهِ ﷺ يُعَالِجُ مِنَ التَّنْزِيلِ شِدَّةً، وَ كَانَ مِمَّا يُحَرِّكُ شَفَتَيْهِ – فَقَالَ ابْنُ عَبَّاسٍ: فَأَنَا أُحَرِّكُهُمَا كَمَا كَانَ رَسُولُ اللهِ ﷺ يُحَرِّكُهُمَا – فَأَنْزَلَ اللهُ تَعَالَى: ﴿لَا تُحَرِّكۡ بِهِۦ لِسَانَكَ لِتَعۡجَلَ بِهِۦٓ ۝١٦ إِنَّ عَلَيۡنَا جَمۡعَهُۥ وَقُرۡءَانَهُۥ ۝١٧﴾ قَالَ: جَمْعُهُ لَكَ فِي صَدْرِكَ وَ تَقْرَأُهُ: ﴿فَإِذَا قَرَأۡنَٰهُ فَٱتَّبِعۡ قُرۡءَانَهُۥ ۝١٨﴾ قَالَ: فَاسْتَمِعْ لَهُ وَ أَنْصِتْ: ﴿ثُمَّ إِنَّ عَلَيۡنَا بَيَانَهُۥ ۝١٩﴾ ثُمَّ إِنَّ عَلَيْنَا أَنْ تَقْرَأَهُ، كَانَ رَسُولُ اللهِ ﷺ بَعْدَ ذَلِكَ إِذَا أَتَاهُ جِبْرِيلُ اسْتَمَعَ، فَإِذَا انْطَلَقَ جِبْرِيلُ قَرَأَهُ النَّبِيُّ ﷺ كَمَا قَرَأَهُ» [رواه البخاري: ٥]

**5.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما Uca Allahın: ***"Cəbrail sənə Quranı nazil etdikdə* onu tələm-tələsik yadda saxlamaq üçün dilini tərpətmə!"**[4] ayəsini izah edib demişdir: "Allahın elçisi ﷺ nazil olan ayələrin (ağırlığından) çətinlik çəkər və (tələm-tələsik) dodaqlarını tərpədərdi." İbn Abbas dedi: "Allahın elçisi ﷺ dodaq-

[1] Xristian, xaçpərəst.
[2] Burada sirrin sahibi deyildikdə Cəbrail عليه السلام nəzərdə tutulur.
[3] "əl-Muddəssir" surəsi, 1-5.
[4] "əl-Qiyamət" surəsi, 16.

larını necə tərpədirdisə, mən də dodaqlarımı eləcə tərpədirəm.” Sonra Uca Allah (bu ayəni) nazil etdi: ***“Cəbrail sənə Quranı nazil etdikdə* onu tələm-tələsik yadda saxlamaq üçün dilini tərpətmə! Şübhəsiz ki, onun *sənin qəlbində* qərar tutması və *dilinlə* oxunması Bizə aiddir”**[1] – (yəni) oxuya biləsən deyə, onu sənin qəlbində cəm edər. **“Biz onu oxuduğumuz zaman sən onun oxunuşunu izlə”**[2] – (yəni) onu dinlə və sus. **“Sonra, sözsüz ki, onu izah etmək də Bizə aiddir”**[3] – (yəni) Bizim öhdəmizə düşən odur ki, sən onu oxuya biləsən.

Bundan sonra Cəbrail (hər dəfə) Peyğəmbərin ﷺ yanına gəldiyi zaman Peyğəmbər ﷺ onu dinləyərdi. Cəbrail getdikdən sonra isə Peyğəmbər ﷺ (Quranın ayələrini) onun oxuduğu kimi oxuyardı. (əl-Buxari, 5)

٦ – عَنْهُ ؓ قَالَ: كَانَ رَسُولُ اللهِ ﷺ أَجْوَدَ النَّاسِ وَكَانَ أَجْوَدَ مَا يَكُونُ فِي رَمَضَانَ حِينَ يَلْقَاهُ جِبْرِيلُ وَكَانَ يَلْقَاهُ فِي كُلِّ لَيْلَةٍ مِنْ رَمَضَانَ فَيُدَارِسُهُ الْقُرْآنَ، فَلَرَسُولُ اللهِ ﷺ أَجْوَدَ بِالْخَيْرِ مِنَ الرِّيحِ الْمُرْسَلَةِ. [رواه البخاري: ٦]

**6.** İbn Abbas ؓ rəvayət edir: “Allahın elçisi ﷺ insanların ən səxavətlisi idi. Ramazan ayında, Cəbrail ilə görüşdüyü zaman isə daha səxavətli olardı. Cəbrail Ramazan ayının hər gecəsində Peyğəmbər ﷺ ilə görüşər, onunla birgə Quranı oxuyub təkrar edərdi. Odur ki, (bu günlərdə) Allahın elçisi ﷺ xeyirxah işlər görməkdə sərbəst əsən küləkdən daha comərd olardı.” (əl-Buxari, 6)

٧ – عَنْ عَبْدِ اللَّهِ بْنَ عَبَّاسٍ رضي الله عنهما أَنَّ أَبَا سُفْيَانَ بْنَ حَرْبٍ أَخْبَرَهُ أَنَّ هِرَقْلَ أَرْسَلَ إِلَيْهِ فِي رَكْبٍ مِنْ قُرَيْشٍ وَكَانُوا تجارًا بِالشَّأْمِ فِي الْمُدَّةِ الَّتِي كَانَ رَسُولُ اللَّهِ ﷺ مَادَّ فِيهَا أَبَا سُفْيَانَ وَكُفَّارَ قُرَيْشٍ فَأَتَوْهُ وَهُمْ بِإِيلِيَاءَ فَدَعَاهُمْ فِي مَجْلِسِهِ وَحَوْلَهُ عُظَمَاءُ الرُّومِ ثُمَّ دَعَاهُمْ وَدَعَا بِتَرْجُمَانِهِ فَقَالَ أَيُّكُمْ أَقْرَبُ نَسَبًا بِهَذَا الرَّجُلِ الَّذِي يَزْعُمُ أَنَّهُ نَبِيٌّ فَقَالَ أَبُو سُفْيَانَ فَقُلْتُ أَنَا أَقْرَبُهُمْ نَسَبًا فَقَالَ أَدْنُوهُ مِنِّي وَقَرِّبُوا أَصْحَابَهُ فَاجْعَلُوهُمْ عِنْدَ ظَهْرِهِ ثُمَّ قَالَ لِتَرْجُمَانِهِ قُلْ لَهُمْ إِنِّي سَائِلٌ هَذَا عَنْ هَذَا الرَّجُلِ فَإِنْ كَذَبَنِي فَكَذِّبُوهُ فَوَاللَّهِ لَوْلاَ الْحَيَاءُ مِنْ أَنْ يَأْثِرُوا عَلَيَّ كَذِبًا لَكَذَبْتُ عَنْهُ ثُمَّ كَانَ أَوَّلَ مَا سَأَلَنِي عَنْهُ أَنْ قَالَ كَيْفَ نَسَبُهُ فِيكُمْ قُلْتُ هُوَ فِينَا ذُو نَسَبٍ قَالَ فَهَلْ قَالَ هَذَا الْقَوْلَ مِنْكُمْ أَحَدٌ قَطُّ قَبْلَهُ قُلْتُ لاَ قَالَ فَهَلْ كَانَ مِنْ آبَائِهِ مِنْ مَلِكٍ قُلْتُ لاَ قَالَ فَأَشْرَافُ النَّاسِ يَتَّبِعُونَهُ أَمْ ضُعَفَاؤُهُمْ فَقُلْتُ بَلْ ضُعَفَاؤُهُمْ قَالَ أَيَزِيدُونَ أَمْ يَنْقُصُونَ قُلْتُ بَلْ يَزِيدُونَ قَالَ فَهَلْ يَرْتَدُّ أَحَدٌ مِنْهُمْ سَخْطَةً لِدِينِهِ بَعْدَ أَنْ يَدْخُلَ فِيهِ قُلْتُ لاَ قَالَ فَهَلْ كُنْتُمْ تَتَّهِمُونَهُ بِالْكَذِبِ قَبْلَ أَنْ يَقُولَ مَا قَالَ قُلْتُ لاَ قَالَ فَهَلْ يَغْدِرُ قُلْتُ لاَ وَنَحْنُ مِنْهُ فِي مُدَّةٍ لاَ نَدْرِي مَا هُوَ فَاعِلٌ فِيهَا قَالَ وَلَمْ تُمْكِنِّي كَلِمَةٌ أُدْخِلُ فِيهَا شَيْئًا غَيْرُ هَذِهِ الْكَلِمَةِ قَالَ فَهَلْ قَاتَلْتُمُوهُ قُلْتُ نَعَمْ قَالَ فَكَيْفَ كَانَ قِتَالُكُمْ إِيَّاهُ قُلْتُ الْحَرْبُ بَيْنَنَا وَبَيْنَهُ سِجَالٌ يَنَالُ مِنَّا وَنَنَالُ مِنْهُ قَالَ مَاذَا يَأْمُرُكُمْ قُلْتُ يَقُولُ اعْبُدُوا اللَّهَ وَحْدَهُ وَلاَ تُشْرِكُوا بِهِ شَيْئًا وَاتْرُكُوا مَا يَقُولُ آبَاؤُكُمْ وَيَأْمُرُنَا بِالصَّلاَةِ وَالزَّكَاةِ وَالصِّدْقِ وَالْعَفَافِ وَالصِّلَةِ فَقَالَ لِلتَّرْجُمَانِ قُلْ لَهُ سَأَلْتُكَ عَنْ نَسَبِهِ فَذَكَرْتَ أَنَّهُ فِيكُمْ ذُو نَسَبٍ فَكَذَلِكَ الرُّسُلُ تُبْعَثُ فِي نَسَبِ قَوْمِهَا وَسَأَلْتُكَ هَلْ قَالَ أَحَدٌ مِنْكُمْ هَذَا الْقَوْلَ فَذَكَرْتَ أَنْ لاَ فَقُلْتُ لَوْ كَانَ أَحَدٌ قَالَ هَذَا الْقَوْلَ قَبْلَهُ لَقُلْتُ رَجُلٌ يَأْتَسِي بِقَوْلٍ قِيلَ قَبْلَهُ وَسَأَلْتُكَ هَلْ كَانَ مِنْ آبَائِهِ مِنْ مَلِكٍ فَذَكَرْتَ أَنْ لاَ قُلْتُ فَلَوْ كَانَ مِنْ آبَائِهِ مِنْ مَلِكٍ قُلْتُ رَجُلٌ يَطْلُبُ مُلْكَ أَبِيهِ وَسَأَلْتُكَ هَلْ كُنْتُمْ تَتَّهِمُونَهُ بِالْكَذِبِ قَبْلَ أَنْ يَقُولَ مَا قَالَ فَذَكَرْتَ أَنْ لاَ فَقَدْ أَعْرِفُ أَنَّهُ لَمْ يَكُنْ لِيَذَرَ الْكَذِبَ عَلَى النَّاسِ وَيَكْذِبَ عَلَى اللَّهِ وَسَأَلْتُكَ أَشْرَافُ النَّاسِ اتَّبَعُوهُ أَمْ ضُعَفَاؤُهُمْ فَذَكَرْتَ أَنَّ ضُعَفَاءَهُمُ اتَّبَعُوهُ وَهُمْ أَتْبَاعُ الرُّسُلِ

[1] “əl-Qiyamət” surəsi, 16-17.
[2] “əl-Qiyamət” surəsi, 18.
[3] “əl-Qiyamət” surəsi, 19.

وَسَأَلْتُكَ أَيَزِيدُونَ أَمْ يَنْقُصُونَ فَذَكَرْتَ أَنَّهُمْ يَزِيدُونَ وَكَذَلِكَ أَمْرُ الإِيمَانِ حَتَّى يَتِمَّ وَسَأَلْتُكَ أَيَرْتَدُّ أَحَدٌ سَخْطَةً لِدِينِهِ بَعْدَ أَنْ يَدْخُلَ فِيهِ فَذَكَرْتَ أَنْ لاَ وَكَذَلِكَ الإِيمَانُ حِينَ تُخَالِطُ بَشَاشَتُهُ الْقُلُوبَ وَسَأَلْتُكَ هَلْ يَغْدِرُ فَذَكَرْتَ أَنْ لاَ وَكَذَلِكَ الرُّسُلُ لاَ تَغْدِرُ وَسَأَلْتُكَ بِمَا يَأْمُرُكُمْ فَذَكَرْتَ أَنَّهُ يَأْمُرُكُمْ أَنْ تَعْبُدُوا اللَّهَ وَلاَ تُشْرِكُوا بِهِ شَيْئًا وَيَنْهَاكُمْ عَنْ عِبَادَةِ الأَوْثَانِ وَيَأْمُرُكُمْ بِالصَّلاَةِ وَالصِّدْقِ وَالْعَفَافِ فَإِنْ كَانَ مَا تَقُولُ حَقًّا فَسَيَمْلِكُ مَوْضِعَ قَدَمَيَّ هَاتَيْنِ وَقَدْ كُنْتُ أَعْلَمُ أَنَّهُ خَارِجٌ لَمْ أَكُنْ أَظُنُّ أَنَّهُ مِنْكُمْ فَلَوْ أَنِّي أَعْلَمُ أَنِّي أَخْلُصُ إِلَيْهِ لَتَجَشَّمْتُ لِقَاءَهُ وَلَوْ كُنْتُ عِنْدَهُ لَغَسَلْتُ عَنْ قَدَمِهِ ثُمَّ دَعَا بِكِتَابِ رَسُولِ اللَّهِ ﷺ الَّذِي بَعَثَ بِهِ دِحْيَةُ إِلَى عَظِيمِ بُصْرَى فَدَفَعَهُ إِلَى هِرَقْلَ فَقَرَأَهُ فَإِذَا فِيهِ بِسْمِ اللَّهِ الرَّحْمَنِ الرَّحِيمِ مِنْ مُحَمَّدٍ عَبْدِ اللَّهِ وَرَسُولِهِ إِلَى هِرَقْلَ عَظِيمِ الرُّومِ سَلاَمٌ عَلَى مَنْ اتَّبَعَ الْهُدَى أَمَّا بَعْدُ فَإِنِّي أَدْعُوكَ بِدِعَايَةِ الإِسْلاَمِ أَسْلِمْ تَسْلَمْ يُؤْتِكَ اللَّهُ أَجْرَكَ مَرَّتَيْنِ فَإِنْ تَوَلَّيْتَ فَإِنَّ عَلَيْكَ إِثْمَ الأَرِيسِيِّينَ وَ ﴿ **يَٰٓأَهۡلَ ٱلۡكِتَٰبِ تَعَالَوۡاْ إِلَىٰ كَلِمَةٖ سَوَآءِۭ بَيۡنَنَا وَبَيۡنَكُمۡ أَلَّا نَعۡبُدَ إِلَّا ٱللَّهَ وَلَا نُشۡرِكَ بِهِۦ شَيۡـٔٗا وَلَا يَتَّخِذَ بَعۡضُنَا بَعۡضًا أَرۡبَابٗا مِّن دُونِ ٱللَّهِۚ فَإِن تَوَلَّوۡاْ فَقُولُواْ ٱشۡهَدُواْ بِأَنَّا مُسۡلِمُونَ** ﴾

قَالَ أَبُو سُفْيَانَ فَلَمَّا قَالَ مَا قَالَ وَفَرَغَ مِنْ قِرَاءَةِ الْكِتَابِ كَثُرَ عِنْدَهُ الصَّخَبُ وَارْتَفَعَتْ الأَصْوَاتُ وَأُخْرِجْنَا فَقُلْتُ لأَصْحَابِي حِينَ أُخْرِجْنَا لَقَدْ أَمِرَ أَمْرُ ابْنِ أَبِي كَبْشَةَ إِنَّهُ يَخَافُهُ مَلِكُ بَنِي الأَصْفَرِ فَمَا زِلْتُ مُوقِنًا أَنَّهُ سَيَظْهَرُ حَتَّى أَدْخَلَ اللَّهُ عَلَيَّ الإِسْلاَمَ وَكَانَ ابْنُ النَّاظُورِ صَاحِبُ إِيلِيَاءَ وَهِرَقْلَ سُقُفًّا عَلَى نَصَارَى الشَّأْمِ يُحَدِّثُ أَنَّ هِرَقْلَ حِينَ قَدِمَ إِيلِيَاءَ أَصْبَحَ يَوْمًا خَبِيثَ النَّفْسِ فَقَالَ بَعْضُ بَطَارِقَتِهِ قَدْ اسْتَنْكَرْنَا هَيْئَتَكَ قَالَ ابْنُ النَّاظُورِ وَكَانَ هِرَقْلُ حَزَّاءً يَنْظُرُ فِي النُّجُومِ فَقَالَ لَهُمْ حِينَ سَأَلُوهُ إِنِّي رَأَيْتُ اللَّيْلَةَ حِينَ نَظَرْتُ فِي النُّجُومِ مَلِكَ الْخِتَانِ قَدْ ظَهَرَ فَمَنْ يَخْتَتِنُ مِنْ هَذِهِ الأُمَّةِ قَالُوا لَيْسَ يَخْتَتِنُ إِلاَّ الْيَهُودُ فَلاَ يُهِمَّنَّكَ شَأْنُهُمْ وَاكْتُبْ إِلَى مَدَايِنِ مُلْكِكَ فَيَقْتُلُوا مَنْ فِيهِمْ مِنْ الْيَهُودِ فَبَيْنَمَا هُمْ عَلَى أَمْرِهِمْ أُتِيَ هِرَقْلُ بِرَجُلٍ أَرْسَلَ بِهِ مَلِكُ غَسَّانَ يُخْبِرُ عَنْ خَبَرِ رَسُولِ اللَّهِ ﷺ فَلَمَّا اسْتَخْبَرَهُ هِرَقْلُ قَالَ اذْهَبُوا فَانْظُرُوا أَمُخْتَتِنٌ هُوَ أَمْ لاَ فَنَظَرُوا إِلَيْهِ فَحَدَّثُوهُ أَنَّهُ مُخْتَتِنٌ وَسَأَلَهُ عَنْ الْعَرَبِ فَقَالَ هُمْ يَخْتَتِنُونَ فَقَالَ هِرَقْلُ هَذَا مُلْكُ هَذِهِ الأُمَّةِ قَدْ ظَهَرَ ثُمَّ كَتَبَ هِرَقْلُ إِلَى صَاحِبٍ لَهُ بِرُومِيَةَ وَكَانَ نَظِيرَهُ فِي الْعِلْمِ وَسَارَ هِرَقْلُ إِلَى حِمْصَ فَلَمْ يَرِمْ حِمْصَ حَتَّى أَتَاهُ كِتَابٌ مِنْ صَاحِبِهِ يُوَافِقُ رَأْيَ هِرَقْلَ عَلَى خُرُوجِ النَّبِيِّ ﷺ وَأَنَّهُ نَبِيٌّ فَأَذِنَ هِرَقْلُ لِعُظَمَاءِ الرُّومِ فِي دَسْكَرَةٍ لَهُ بِحِمْصَ ثُمَّ أَمَرَ بِأَبْوَابِهَا فَغُلِّقَتْ ثُمَّ اطَّلَعَ فَقَالَ يَا مَعْشَرَ الرُّومِ هَلْ لَكُمْ فِي الْفَلاَحِ وَالرُّشْدِ وَأَنْ يَثْبُتَ مُلْكُكُمْ فَتُبَايِعُوا هَذَا النَّبِيَّ فَحَاصُوا حَيْصَةَ حُمُرِ الْوَحْشِ إِلَى الأَبْوَابِ فَوَجَدُوهَا قَدْ غُلِّقَتْ فَلَمَّا رَأَى هِرَقْلُ نَفْرَتَهُمْ وَأَيِسَ مِنْ الإِيمَانِ قَالَ رُدُّوهُمْ عَلَيَّ وَقَالَ إِنِّي قُلْتُ مَقَالَتِي آنِفًا أَخْتَبِرُ بِهَا شِدَّتَكُمْ عَلَى دِينِكُمْ فَقَدْ رَأَيْتُ فَسَجَدُوا لَهُ وَرَضُوا عَنْهُ فَكَانَ ذَلِكَ آخِرَ شَأْنِ هِرَقْلَ. [رواه البخاري: ٧]

**7.** İbn Abbasın ﷺ rəvayətinə görə, Əbu Süfyan ibn Hərb ona xəbər vermişdir ki, o, Qureyş karvanını müşayiət etdiyi zaman Herakl onu öz yanına çağırtdırdı. O vaxt qureyşlilər Şamda ticarət edirdilər. Bu da Peyğəmbərin ﷺ Əbu Süfyan və (başqa) Qureyş kafirləri ilə Hudeybiyədəki[1] sülh müqaviləsi bağladığı vaxta təsadüf edirdi. Əbu Süfyan yoldaşları ilə birgə İliyaya[2] – imperatorun yanına gəldilər. Herakl Rum zadəganlarının əhatəsində ikən qureyşliləri öz məclisinə dəvət etdi. Sonra onları öz hüzuruna çağırtdırdı və tərcüməçisinin gəlməsini əmr etdi. (Herakl) soruşdu: "Peyğəmbər olduğunu iddia edən bu adama nəsəbcə ən yaxın olan hansınızdır?"

[1] Hudeybiyyə – Məkkənin 16 kilometrliyində Ciddəyə gedən yolda yerləşən yer. Hicri tarixin 6-cı ilində orada Muhəmməd Peyğəmbərlə ﷺ müsəlmanları şəhərə buraxmayan və onları ümrə ziyarəti etməyə qoymayan məkkəlilər arasında sülh müqaviləsi bağlanmışdı.

[2] İliya – Qüds.

Əbu Süfyan dedi: Mən: “Onların nəsəbcə ən yaxın olanı mənəm”– deyə cavab verdim. İmperator dedi: “Onu yaxına gətirin, yoldaşlarını isə onun arxa tərəfində saxlayın.” Sonra tərcüməçisinə dedi: “Onlara de ki, mən bundan o adam haqqında soruşacağam. Əgər mənə yalan danışsa, siz də onu yalançı hesab edin.”

(Əbu Süfyan ﷺ dedi): “Vallahi, dostlarımın orada-burada mənim yalanım barədə danışacaqlarından utanmasaydım, onun barəsində əlbət ki, yalan danışardım.” Sonra (Heraklın) onun barəsində məndən ilk soruşduğu bu oldu: “Aranızda onun əsli-nəsəbi necədir?” Mən: “O, bizim aramızda əsilli-nəsəblidir”– dedim. O soruşdu: “Sizlərdən ondan əvvəl bu sözü deyən (peyğəmbərlik iddiası edən) bir kimsə olubmu?” Mən: “Xeyr!”– dedim. O soruşdu: “Heç onun ata-babalarından padşah olubmu?” Mən: “Xeyr!”– dedim. O soruşdu: “Onun ardınca gedənlər xalqın zadəganlarıdır, yoxsa zəifləri?” Mən: “Xalqın zəifləridir”– dedim. O soruşdu: “Onlar artırlar, yoxsa azalırlar?” Mən: “Artırlar”– dedim. O soruşdu: “İçərilərində onun dinini qəbul etdikdən sonra narazılığa görə dinindən dönən bir kimsə varmı?” Mən: “Yoxdur!”– dedim. O soruşdu: “Söylədiklərini deməzdən (bu dinə dəvət etməzdən) əvvəl heç onu yalan danışmaqda ittiham etmişdinizmi?” Mən: “Xeyr!”– dedim. O soruşdu: “Heç əhdi pozurmu?” Mən: “Xeyr (pozmur), lakin bizimlə onun arasında müvəqqəti sülh müqaviləsi mövcuddur və bu müddət ərzində onun nə edəcəyini də bilmirik”– dedim.

Əbu Süfyan dedi ki, mən deyilənlərə əlavə etmək üçün bu kəlmədən başqa bir şey tapa bilmədim. (Herakl) soruşdu: “Heç onunla döyüşmüsünüzmü?” Mən: “Bəli!”– dedim. O soruşdu: “Onunla döyüşünüz nə ilə nəticələnib?” Mən dedim: “Bizimlə onun arasında gedən döyüş dəyişkəndir. Gah o bizə qalib gəlir, gah da biz ona qalib gəlirik.” O soruşdu: “Sizə nəyi əmr edir?” Mən dedim: “O deyir ki, Tək Allaha ibadət edin, heç nəyi Ona şərik qoşmayın, atalarınızın söylədiklərini tərk edin. Habelə namaz qılmağı, zəkat verməyi, doğru danışmağı, iffətli olmağı və qohumluq əlaqələrini möhkəmləndirməyi də bizə əmr edir.” Sonra (Herakl) tərcüməçiyə belə buyurdu: “Ona de ki: “Səndən onun nəsəbi barədə soruşdum, aranızda əsilli-nəsəbli olduğunu bildirdin. Həmçinin (əvvəlki) elçilər də öz xalqlarının adlı-sanlı nəslinə mənsub olardılar. Sizlərdən ondan əvvəl bu sözü söyləyən bir kimsə olubmu deyə soruşdum, dedin ki, xeyr. Mən düşündüm ki, əgər ondan əvvəl bu sözü söyləmiş bir kimsə olsaydı, deyərdim ki, bu adam özündən əvvəl deyilmiş bir sözü təkrar edir. Ata-babalarının içində padşah olubmu deyə soruşdum, dedin ki, xeyr. Mən fikirləşdim ki, əgər ata-babalarından padşah olmuş olsaydı, deyərdim ki, bu adam atasının mülkünü geri almağa çalışır. Söylədiklərini deməzdən əvvəl onu yalan danışmaqda ittiham etmişdinizmi deyə soruşdum, dedin ki, xeyr. Mənə aydın oldu ki, insanlara qarşı yalan danışmayan adam, Allaha qarşı da yalan danışmaz. Onun ardınca gedənlər xalqın zadəganlarıdır, yoxsa zəifləridir deyə soruşdum, onun ardınca gedənlərin xalqın zəifləri olduğunu söylədin. Elçilərin ardınca gedənlər də məhz onlardır. Onlar artırlar, yoxsa azalırlar deyə soruşdum, dedin ki, onlar artırlar. İmanın vəziyyəti də tamam oluncaya qədər beləcə davam edər. İçərilərində onun dinini qəbul etdikdən sonra narazılığa görə dinindən dönən bir kimsə varmı deyə soruşdum, dedin ki, yoxdur. Təbii ki, bu cür iman qəlblərə daxil olduqda belə olur. Əhdi pozurmu deyə soruşdum, dedin ki, xeyr. Peyğəmbərlər də belə olur, əhdi pozmurlar. Sizə nəyi əmr edir deyə soruşdum. Dedin ki, Tək Allaha ibadət edib heç nəyi Ona şə-

rik qoşmamağı sizə əmr edir və bütlərə tapınmağı sizə qadağan edir. Üstəlik namaz qılmağı, doğru danışmağı və iffətli olmağı da sizə əmr edir. Və əgər sənin dediklərin doğrudursa, onda o, bu ayaqlarımın basdığı yerə sahib olacaqdır. Mən bilirdim ki, o gələcək, lakin sizlərdən olacağını güman etmirdim. Əgər onun yanına gedib çata biləcəyimə arxayın olsaydım, hər halda onunla görüşməyə çalışardım. Və əgər yanında olsaydım, ayaqlarını yuyardım."

Sonra o, Dihyanın[1] vasitəsilə Busranın[2] hökmdarına[3] göndərilmiş (və onun tərəfindən Herakla çatdırılmış) Peyğəmbərin ﷺ məktubunu tələb etdi. Qasid[4] məktubu Herakla verdi. O da oxudu. Məktubda bunlar yazılmışdı:

**Mərhəmətli və Rəhmli Allahın adı ilə!**

Allahın qulu və rəsulu Muhəmməddən Rum imperatoru Herakla. Haqq yolu tutub gedənlərə salam olsun! Bundan sonra, mən səni İslama dəvət edirəm. İslamı qəbul et ki, salamat qalasan və Allah sənin mükafatını ikiqat versin. Əgər qəbul etməsən, tabeçiliyində olanların günahı sənin boynunda qalacaqdır. (Sənə Allahın mənə buyurduğunu deyirəm): **"Ey Kitab əhli! Bizim və sizin aranızda olan eyni bir kəlməyə gəlin ki, Allahdan başqasına ibadət etməyək, Ona heç bir şeyi şərik qoşmayaq və Allahı qoyub bir-birimizi ilahiləşdirməyək." Əgər onlar üz döndərsələr, deyin: "Şahid olun ki, biz müsəlmanlarıq!"**[5]

Əbu Süfyan dedi: "Herakl deyəcəyini dedikdən və məktubu oxuyub qurtardıqdan sonra onun hüzurunda hay-küy qalxdı, səslər ucaldı və bizi bayıra çıxartdılar. Onda mən yoldaşlarıma dedim: "İbn Əbu Kəbşənin[6] işi (dəvəti) o qədər böyümüşdür ki, Bəni-Əsfarın[7] hökmdarı belə ondan qorxur." Peyğəmbərin ﷺ qalib gələcəyinə Allah İslamı qəlbimə salıncaya qədər qətiyyətlə inanmağa davam etdim.

İliyanın sahibi və Heraklın dostu İbn Nazur[8] Şam xristianlarının baş keşişi idi. O, rəvayət edir ki, Herakl İliyaya gəldiyi zaman, (farslara qalib gəldiyi günlərin birində) səhər oyanarkən əhvali-ruhiyyəsi çox pis idi. Heraklın patriarxlarından bəziləri ona: "Sənin halın xoşumuza gəlmir"– dedilər.

İbn Nazur deyir ki, Herakl ulduzlara əsasən fala baxan, kahin idi. Odur ki, onların sualına belə cavab verdi: "Mən bu gecə ulduzlara baxarkən Sünnət[9] hökmdarının qalib gəldiyini gördüm. (Bir deyin görək) xalqlar arasında sünnət edənlər kimlərdir?" Onlar dedilər: "Yəhudilərdən başqa heç kəs sünnət etmir. Onların işi səni təşvişə salmasın. Səltənətinin şəhərlərinə xəbər göndər ki, oralardakı yəhudiləri öldürsünlər." Elə bu vaxt Heraklın hüzuruna Ğəssan hökmdarının Allahın elçisi ﷺ barəsində xəbər vermək üçün göndərdiyi adam gətirildi. Herakl qasiddən xəbər aldıqdan sonra (xidmətçilərinə əmr edib) dedi: "Gedin baxın görün, bu (kişi) sünnət edilib, ya yox." (Xidmətçilər o kişiyə) baxdıqdan sonra

---

[1] Dihya ibn Xəlifə əl-Kəlbi ؓ əshabədir.
[2] Mədinə ilə Dəməşq arasında yerləşən şəhərdir. Hal-hazırda Suriyanın ərazisində yerləşir.
[3] Adı Haris ibn Əbu Şəmr əl-Ğəssanidir.
[4] Bu, o zamanlar hələ İslam dinini qəbul etməmiş Adiy ibn Hatim ؓ idi.
[5] Ali-İmran, 64.
[6] Burada Əbu Süfyan ؓ Peyğəmbəri ﷺ qəsd edir. Əbu Kəbşə Peyğəmbərin ﷺ babalarından birinin adıdır.
[7] Ərəblər rumluları belə çağırardılar.
[8] Ərəbcə bostan gözətçisi deməkdir.
[9] Müsəlmanlarda və yəhudilərdə yetkinlik yaşına çatmamış oğlan uşaqlarının kişilik əzasının dəri hissəsinin kəsilməsindən ibarət əməliyyat.

onun sünnət edilmiş olduğunu Herakla xəbər verdilər. Herakl ondan ərəblər barədə soruşdu. (Qasid) dedi: "Onlar da sünnət olunurlar." Herakl buyurdu: "Budur, bu xalqın hökmranlığı artıq zühur etmişdir." Sonra Herakl Rumiyyada yaşayan və elmdə (fala baxmaqda) özünə həmfikir olan dostuna məktub yazdı. (Məktubdan sonra) Herakl Himsə[1] getdi və Peyğəmbərin ﷺ zühuru və onun həqiqətən də peyğəmbər olduğu barədə fikirlərinə həmrəy olan dostundan məktub alanadək Himsi tərk etmədi. Herakl Rum zadəganlarını Himsdəki qəsrinə dəvət edib qapıların bağlanılmasını əmr etdi. Sonra onların qarşısına çıxıb dedi: "Ey Rumlular! Bu Peyğəmbərə ﷺ beyət[2] edib nicat tapmaq, doğru yola yönəlmək və bir də mülkünüzün qalmağını istəmirsinizmi?" Onlar (bu sözləri eşidən kimi) vəhşi eşşəklər qaçışına bənzər (sürətlə) qapıya doğru qaçdılar, lakin qapıların bağlanmış olduğunu gördülər. Herakl onlardakı nifrəti gördükdə, iman gətirəcəklərindən ümidini üzüb: "Onları yanıma gətirin!"– deyə buyurdu. (Zadəganlar onun hüzuruna gəldikdə isə belə) dedi: "Mən bayaq dediklərimi ancaq dininizə olan sıx bağlılığınızı yoxlamaq üçün söylədim. İndi isə (buna) şahid oldum." Zadəganlar onun qarşısında səcdə etdilər və ondan razı qaldılar. Herakl barəsindəki xəbərin (dəvətə olan münasibətinin) sonu belə oldu. (əl-Buxari, 7)

[1] Hazırda Suriyanın ərazisində yerləşir.
[2] Peyğəmbərin ﷺ dəvətini qəbul edərək ona tabe və sadiq olma.

# ٢ – كِتابُ الإيمان

# 2 – İman kitabı

## ١– باب: قَوْلُ النَّبِيِّ ﷺ: ﴿ بُنِيَ الإِسْلاَمُ عَلَى خَمْسٍ ﴾

## 1-ci fəsil. Peyğəmbərin ﷺ: «İslam beş (əsas) üzərində qurulmuşdur»– sözü

٨ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ بُنِيَ الإِسْلاَمُ عَلَى خَمْسٍ شَهَادَةِ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ وَإِقَامِ الصَّلاَةِ وَإِيتَاءِ الزَّكَاةِ وَالْحَجِّ وَصَوْمِ رَمَضَانَ. [رواه البخاري: ٨]

**8.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İslam beş (əsas) üzərində qurulmuşdur: Allahdan başqa (ibadətə haqqı olan) məbud olmadığına və Muhəmmədin ﷺ Allahın elçisi olduğuna şahidlik etmək, namaz qılmaq, zəkat vermək, həcc etmək və Ramazan orucunu tutmaq." (əl-Buxari, 8)

## ٢– باب: أُمُورُ الإِيْمَانِ

## 2-ci fəsil. İmana aid işlər

٩ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه، عَنْ النَّبِيِّ ﷺ قَالَ الإِيمَانُ بِضْعٌ وَسِتُّونَ شُعْبَةً وَالْحَيَاءُ شُعْبَةٌ مِنْ الإِيمَانِ. [رواه البخاري: ٩]

**9.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İman altmış və bir neçə şöbədən ibarətdir. Həya da imanın şöbələrindəndir." (əl-Buxari, 9)

## ٣– باب: الْمُسْلِمُ مَنْ سَلِمَ الْمُسْلِمُونَ مِنْ لِسَانِهِ وَ يَدِهِ

## 3-cü fəsil. Müsəlman o kəsdir ki, onun dilindən və əlindən başqa müsəlmanlara zərər dəymir

١٠ – عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو رضي الله عنهما، عَنْ النَّبِيِّ ﷺ قَالَ الْمُسْلِمُ مَنْ سَلِمَ الْمُسْلِمُونَ مِنْ لِسَانِهِ وَيَدِهِ وَالْمُهَاجِرُ مَنْ هَجَرَ مَا نَهَى اللَّهُ عَنْهُ. [رواه البخاري: ١٠]

**10.** Abdullah ibn Amr رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlman o kəsdir ki, onun dilindən və əlindən başqa müsəlmanlara zərər dəyməsin; mühacir də o kəsdir ki, Allahın qadağan etdiyi şeyləri tərk edə." (əl-Buxari, 10)

## ٤– باب: أَيُّ الإِسْلاَمِ أَفْضَلُ؟

## 4-cü fəsil. Hansı müsəlman daha fəzilətli sayılır?

١١ – عَنْ أَبِي مُوسَى رضي الله عنه قَالَ: قَالُوا يَا رَسُولَ اللَّهِ أَيُّ الإِسْلاَمِ أَفْضَلُ؟ قَالَ مَنْ سَلِمَ الْمُسْلِمُونَ مِنْ لِسَانِهِ وَيَدِهِ. [رواه البخاري: ١١]

**11.** Əbu Musa رضي الله عنه rəvayət edir ki, (əshabələr) soruşdu: "Ey Allahın elçisi! Hansı müsəlman daha fəzilətli sayılır?" Peyğəmbər ﷺ dedi: "Dilindən və əlindən müsəlmanlara zərər dəyməyən (müsəlman)." (əl-Buxari, 11)

## 5-ci fəsil. Yemək yedirtmək İslamdandır

## ٥– باب: إِطْعَامُ الطَّعَامِ مِنَ الإِسْلاَمِ

١٢ – عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ﵄، أَنَّ رَجُلاً سَأَلَ النَّبِيَّ ﷺ أَيُّ الإِسْلاَمِ خَيْرٌ قَالَ تُطْعِمُ الطَّعَامَ وَتَقْرَأُ السَّلاَمَ عَلَى مَنْ عَرَفْتَ وَمَنْ لَمْ تَعْرِفْ. [رواه البخاري: ١٢]

**12.** Abdullah ibn Amr ﵄ rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "İslam (xislətlərindən) ən xeyirlisi hansıdır?" Peyğəmbər ﷺ dedi: "Sənin yemək yedirtməyin, tanıdığına və tanımadığına salam verməyin." (əl-Buxari, 12)

## 6-cı fəsil. (Adamın) özü üçün istədiyini (müsəlman) qardaşı üçün də istəməsi imandandır

## ٦– باب: مِنَ الإِيْمَانِ أَنْ يُحِبَّ لأَخِيهِ مَا يُحِبُّ لِنَفْسِهِ

١٣ – عَنْ أَنَسٍ ﵁، عَنْ النَّبِيِّ ﷺ قَالَ لاَ يُؤْمِنُ أَحَدُكُمْ حَتَّى يُحِبَّ لأَخِيهِ مَا يُحِبُّ لِنَفْسِهِ. [رواه البخاري: ١٣]

**13.** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz özü üçün istədiyini (müsəlman) qardaşı üçün istəmədikcə, (tam şəkildə) iman etmiş olmaz." (əl-Buxari, 13)

## 7-ci fəsil. Rəsulullahı ﷺ sevmək imandandır

## ٧– باب: حُبُّ رَسُولُ اللهِ ﷺ مِنَ الإِيْمَانِ

١٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ فَوَالَّذِي نَفْسِي بِيَدِهِ لاَ يُؤْمِنُ أَحَدُكُمْ حَتَّى أَكُونَ أَحَبَّ إِلَيْهِ مِنْ وَالِدِهِ وَوَلَدِهِ. [رواه البخاري: ١٤]

**14.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Canım Əlində olan Allaha and olsun ki, sizdən biriniz məni valideynindən və övladından çox istəməyincə, iman gətirmiş olmaz." (əl-Buxari, 14)

١٥ – رَوَى أَنَسٌ ﵁ الْحَدِيثَ بِعَيْنِهِ وَ زَادَ فِي آخِرِهِ: وَ النَّاسِ أَجْمَعِينَ. [رواه البخاري: ١٥]

**15.** Ənəs ﵁ bu hədisi eyni ilə rəvayət edib axırda "və bütün insanlardan" sözünü də əlavə etmişdir. (əl-Buxari, 15)

## 8-ci fəsil. İmanın şirinliyi

## ٨– باب: حَلاَوَةُ الإِيْمَانِ

١٦ – عَنْهُ ﵁، عَنْ النَّبِيِّ ﷺ قَالَ ثَلاَثٌ مَنْ كُنَّ فِيهِ وَجَدَ حَلاوَةَ الإِيمَانِ أَنْ يَكُونَ اللَّهُ وَرَسُولُهُ أَحَبَّ إِلَيْهِ مِمَّا سِوَاهُمَا وَأَنْ يُحِبَّ الْمَرْءَ لاَ يُحِبُّهُ إِلاَّ لِلَّهِ وَأَنْ يَكْرَهَ أَنْ يَعُودَ فِي الْكُفْرِ كَمَا يَكْرَهُ أَنْ يُقْذَفَ فِي النَّارِ. [رواه البخاري: ١٦]

**16.** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kimdə (bu) üç şey olsa, imanın şirinliyini dadmış olar: Allahı və Onun elçisini başqalarından daha çox sevmək; adamı yalnız Allah üçün sevmək; Cəhənnəmə atılmağı xoşlamadığı kimi, küfrə qayıtmağı da xoşlamamaq." (əl-Buxari, 16)

## 9-cu fəsil. (Kamil) imanın əlaməti ənsarı[1] sevməkdir

## ٩– باب: عَلاَمَةُ الإِيْمَانِ حُبُّ الأَنْصَارِ

١٧ – عَنْهُ ﷺ، عَنْ النَّبِيِّ ﷺ قَالَ آيَةُ الإِيمَانِ حُبُّ الأَنْصَارِ وَآيَةُ النِّفَاقِ بُغْضُ الأَنْصَارِ. [رواه البخاري: ١٧]

**17.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Kamil) imanın əlaməti ənsarı sevməkdir, münafiqliyin əlaməti isə ənsara nifrət etməkdir." (əl-Buxari, 17)

١٨ – عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ وَحَوْلَهُ عِصَابَةٌ مِنْ أَصْحَابِهِ بَايِعُونِي عَلَى أَنْ لاَ تُشْرِكُوا بِاللَّهِ شَيْئًا وَلاَ تَسْرِقُوا وَلاَ تَزْنُوا وَلاَ تَقْتُلُوا أَوْلاَدَكُمْ وَلاَ تَأْتُوا بِبُهْتَانٍ تَفْتَرُونَهُ بَيْنَ أَيْدِيكُمْ وَأَرْجُلِكُمْ وَلاَ تَعْصُوا فِي مَعْرُوفٍ فَمَنْ وَفَى مِنْكُمْ فَأَجْرُهُ عَلَى اللَّهِ وَمَنْ أَصَابَ مِنْ ذَلِكَ شَيْئًا فَعُوقِبَ فِي الدُّنْيَا فَهُوَ كَفَّارَةٌ لَهُ وَمَنْ أَصَابَ مِنْ ذَلِكَ شَيْئًا ثُمَّ سَتَرَهُ اللَّهُ فَهُوَ إِلَى اللَّهِ إِنْ شَاءَ عَفَا عَنْهُ وَإِنْ شَاءَ عَاقَبَهُ فَبَايَعْنَاهُ عَلَى ذَلِكَ. [رواه البخاري: ١٨]

**18.** Ubadə ibn Samit ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ətrafında əshabələrindən bir dəstə olarkən dedi: "Mənə beyət edin ki, Allaha şərik qoşmayacaqsınız, oğurluq etməyəcəksiniz, zina eləməyəcəksiniz, uşaqlarınızı öldürməyəcəksiniz, yalan uydurub (kimsəyə) iftira atmayacaqsınız, şəriətin buyurduğundan boyun qaçırmayacaqsınız! Sizlərdən hər kim bu əhdə vəfa etsə, onun savabını Allah verər. Kim də bu günahlardan birini edib sonra dünyada ikən cəzalandırılsa, bu onun üçün kəffarə[2] olar. Kim bu günahlardan birini etdikdən sonra da Allah onu gizlədərsə, onun işi Allaha qalar. İstəsə, onu bağışlayar, istəsə onu cəzalandırar." Biz də buna beyət etdik. (əl-Buxari, 18)

## 10-cu fəsil. Fitnələrdən qaçmaq dindəndir

## ١٠– باب: مِنَ الدِّينِ الْفِرَارُ مِنَ الْفِتَنِ

١٩ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ أَنَّهُ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ يُوشِكُ أَنْ يَكُونَ خَيْرَ مَالِ الْمُسْلِمِ غَنَمٌ يَتْبَعُ بِهَا شَعَفَ الْجِبَالِ وَمَوَاقِعَ الْقَطْرِ يَفِرُّ بِدِينِهِ مِنْ الْفِتَنِ. [رواه البخاري: ١٩]

**19.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Tezliklə (elə qarışıqlıqlar baş verəcək ki, o zaman) müsəlmanın ən xeyirli malı dininə görə fitnələrdən qaçaraq dağların başında və yağmur düşən vadilərdə otardığı qoyunları olacaqdır." (əl-Buxari, 19)

## 11-ci fəsil. Peyğəmbərin ﷺ: «Aranızda Allahı ən yaxşı tanıyan mənəm»– deməsi

## ١١– باب: قَوْلُ النَّبِيِّ ﷺ: ﴿ أَنَا أَعْلَمُكُمْ بِاللهِ ﴾

٢٠ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا أَمَرَهُمْ أَمَرَهُمْ مِنَ الأَعْمَالِ بِمَا يُطِيقُونَ قَالُوا إِنَّا لَسْنَا كَهَيْئَتِكَ يَا رَسُولَ اللَّهِ إِنَّ اللَّهَ قَدْ غَفَرَ لَكَ مَا تَقَدَّمَ مِنْ ذَنْبِكَ وَمَا تَأَخَّرَ فَيَغْضَبُ حَتَّى يُعْرَفَ الْغَضَبُ فِي وَجْهِهِ ثُمَّ يَقُولُ إِنَّ أَتْقَاكُمْ وَأَعْلَمَكُمْ بِاللَّهِ أَنَا. [رواه البخاري: ٢٠]

[1] İslamı qəbul etmiş və Muhəmməd Peyğəmbərin ﷺ sədaqətli silahdaşları olmuş Mədinənin yerli sakinləri. Onlar Məkkədən və başqa şəhərlərdən gələn mühacirləri evlərinə qəbul edir və onları zəruri əşyalarla təmin edirdilər.

[2] Günahların bağışlanılması üçün şəriətin buyurduğu qaydada verilən cəza, yaxud deyilən söz və ya verilən sədəqə.

**20.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ əshabələrinə əmr etdiyi zaman onlara gücləri yetdiyi bir şeyi əmr edərdi. Onlar (bəzən) deyərdilər: "Ya Rəsulullah! Axı biz sənin kimi deyilik. Doğrusu, Allah sənin keçmiş və gələcək günahlarını bağışlamışdır." O isə (buna) üzündə qəzəb əlaməti görününcəyə qədər hiddətlənər, sonra da deyərdi: "Şübhəsiz ki, içinizdə (Allahdan) ən çox qorxan və Allahı ən yaxşı tanıyan mənəm!" (əl-Buxari, 20)

## 12-ci fəsil. İman əhlinin əməllər sayəsində bir-birindən üstün olması

## ١٢– باب: تَفَاضُلِ أَهْلِ الإِيمَانِ فِي الأَعْمَالِ

٢١ – عَنْ أَبِي سَعِيد الْخُدْرِي ﵁، عَنْ النَّبِيِّ ﷺ قَالَ يَدْخُلُ أَهْلُ الْجَنَّة الْجَنَّةَ وَأَهْلُ النَّارِ النَّارَ ثُمَّ يَقُولُ اللَّهُ تَعَالَى أَخْرِجُوا مِنْ النَّارِ مَنْ كَانَ فِي قَلْبِه مِثْقَالُ حَبَّة مِنْ خَرْدَل مِنْ إِيمَان فَيُخْرَجُونَ مِنْهَا قَدْ اسْوَدُّوا فَيُلْقَوْنَ فِي نَهَرِ الْحَيَا أَوْ الْحَيَاة شَكَّ مَالِكٌ فَيَنْبُتُونَ كَمَا تَنْبُتُ الْحِبَّةُ فِي جَانِبِ السَّيْلِ أَلَمْ تَرَ أَنَّهَا تَخْرُجُ صَفْرَاءَ مُلْتَوِيَةً. [رواه البخاري:٢٢]

**21.** Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnət əhli Cənnətə, Cəhənnəm əhli də Cəhənnəmə daxil olduqdan sonra Uca Allah buyuracaq: "Qəlbində xardal dənəsi ağırlığında imanı olan hər kəsi (Cəhənnəmdən) çıxarın!" Beləcə, onlar oradan qapqara qaralmış halda çıxarılıb yağışdan əmələ gələn çaya (və ya Həyat çayına) atılacaq və selin kənarında qalan toxumlar necə cücərirsə, onlar da eləcə cücərəcəklər. Məgər (torpağın üstünə) çıxan sapsarı, əyilmiş cücərtiləri görmədinmi?" (əl-Buxari, 22)

٢٢ – عَنْهُ ﵁ قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ بَيْنَا أَنَا نَائِمٌ رَأَيْتُ النَّاسَ يُعْرَضُونَ عَلَيَّ وَعَلَيْهِمْ قُمُصٌ مِنْهَا مَا يَبْلُغُ الثُّدِيَّ وَمِنْهَا مَا دُونَ ذَلِكَ وَعُرِضَ عَلَيَّ عُمَرُ بْنُ الْخَطَّابِ وَعَلَيْهِ قَمِيصٌ يَجُرُّهُ قَالُوا فَمَا أَوَّلْتَ ذَلِكَ يَا رَسُولَ اللَّهِ قَالَ الدِّينَ. [رواه البخاري: ٢٣]

**22.** Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yuxuda olduğum zaman insanlar mənə göstərildi. Onların əyinlərində köynəklər var idi. Bu köynəklərin bəzisi sinəyə çatırdı, bəzisi isə bundan aşağı idi. Ömər ibn Xəttabı da mənə göstərdilər. Onun əynində (ətəyi yerlə) sürünən bir köynək var idi." (Əshabələr): "Bunu nəyə yozdun, ya Rəsulullah?"– deyə soruşdular. "Dinə (yozdum)!"– dedi. (əl-Buxari, 23)

## 13-cü fəsil. Həya imandandır

## ١٣– باب: الْحَيَاءُ مِنَ الإِيْمَانِ

٢٣ – عَنْ ابْنِ عُمَرَ ﵄: أَنَّ رَسُولَ اللَّهِ ﷺ مَرَّ عَلَى رَجُلٍ مِنْ الأَنْصَارِ وَهُوَ يَعِظُ أَخَاهُ فِي الْحَيَاءِ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ دَعْهُ فَإِنَّ الْحَيَاءَ مِنْ الإِيمَانِ. [رواه البخاري: ٢٤]

**23.** İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ ənsardan olan qardaşına (həddən ziyadə) həyalı olmamağı nəsihət edən bir kişinin yanından keçərkən demişdir: "Onu burax! Çünki həya imandandır." (əl-Buxari, 24)

### 14-cü fəsil. (Uca Allahın): «Əgər tövbə etsələr, namaz qılıb zəkat versələr, onları sərbəst buraxın»[1]– sözü

### ١٤– باب: ﴿ فَإِن تَابُوا۟ وَأَقَامُوا۟ ٱلصَّلَوٰةَ وَءَاتَوُا۟ ٱلزَّكَوٰةَ فَخَلُّوا۟ سَبِيلَهُمْ ﴾

٢٤ – وَ عَنْهُ رضي الله عنهما: أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَشْهَدُوا أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ وَيُقِيمُوا الصَّلاَةَ وَيُؤْتُوا الزَّكَاةَ فَإِذَا فَعَلُوا ذَلِكَ عَصَمُوا مِنِّي دِمَاءَهُمْ وَأَمْوَالَهُمْ إِلاَّ بِحَقِّ الإِسْلاَمِ وَحِسَابُهُمْ عَلَى اللَّهِ. [رواه البخاري: ٢٥]

**24.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İnsanlar Allahdan başqa (ibadətə haqqı olan) məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət gətirməyincə, namaz qılıb zəkat verməyincə (onlarla) vuruşmaq mənə əmr edildi. Əgər (aşkarda) bunu yerinə yetirsələr, – İslam haqqı (cinayətə görə veriləcək cəza) istisna olmaqla, – canlarını və mallarını məndən qorumuş olarlar. Onların (batini əməllərinin) haqq-hesabı isə Allaha aiddir.” (əl-Buxari, 25)

### 15-ci fəsil. «İman əməldir»– deyən adam

### ١٥– باب: مَنْ قَالَ: إِنَّ الإِيْمَانَ هُوَ الْعَمَلُ

٢٥ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه: أَنَّ رَسُولَ اللَّهِ ﷺ سُئِلَ أَيُّ الْعَمَلِ أَفْضَلُ فَقَالَ إِيمَانٌ بِاللَّهِ وَرَسُولِهِ قِيلَ ثُمَّ مَاذَا قَالَ الْجِهَادُ فِي سَبِيلِ اللَّهِ قِيلَ ثُمَّ مَاذَا قَالَ حَجٌّ مَبْرُورٌ. [رواه البخاري: ٢٦]

**25.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbərdən ﷺ soruşdular: “Hansı əməl ən yaxşı əməl sayılır?” Dedi: “Allaha və Onun elçisinə iman gətirmək”. Soruşdular: “Bəs sonra hansıdır?” Dedi: “Allah yolunda cihad etmək”. (Yenə) soruşdular: “Bəs sonra hansıdır?” Dedi: “Qəbul olunmuş həcc”. (əl-Buxari, 26)

### 16-cı fəsil. (Adamın qəbul etdiyi) İslam həqiqətə uyğun olmazsa

### ١٦– باب: إِذَا لَمْ يَكُنِ الإِسْلاَمُ عَلَى الْحَقِيقَةِ

٢٦ – عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ رضي الله عنه: أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَعْطَى رَهْطًا وَسَعْدٌ جَالِسٌ فَتَرَكَ رَسُولُ اللَّهِ ﷺ رَجُلاً هُوَ أَعْجَبُهُمْ إِلَيَّ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ مَا لَكَ عَنْ فُلاَنٍ فَوَاللَّهِ إِنِّي لأَرَاهُ مُؤْمِنًا فَقَالَ أَوْ مُسْلِمًا فَسَكَتُّ قَلِيلاً ثُمَّ غَلَبَنِي مَا أَعْلَمُ مِنْهُ فَعُدْتُ لِمَقَالَتِي فَقُلْتُ مَا لَكَ عَنْ فُلاَنٍ فَوَاللَّهِ إِنِّي لأَرَاهُ مُؤْمِنًا فَقَالَ أَوْ مُسْلِمًا ثُمَّ غَلَبَنِي مَا أَعْلَمُ مِنْهُ فَعُدْتُ لِمَقَالَتِي وَعَادَ رَسُولُ اللَّهِ ﷺ ثُمَّ قَالَ يَا سَعْدُ إِنِّي لأُعْطِي الرَّجُلَ وَغَيْرُهُ أَحَبُّ إِلَيَّ مِنْهُ خَشْيَةَ أَنْ يَكُبَّهُ اللَّهُ فِي النَّارِ. [رواه البخاري: ٢٧]

**26.** Səd ibn Əbu Vəqqas رضي الله عنه rəvayət edir ki, (bir gün) Peyğəmbər ﷺ bir dəstə adama hədiyyə verərkən mən də (onların yanında) oturmuşdum. Peyğəmbər ﷺ onlardan ən çox xoşuma gələn bir adama heç nə vermədi. Dedim: “Ya Rəsulullah! Niyə filankəsi kənarda qoydun? Vallahi ki, mən onu mömin hesab edirəm.” (Peyğəmbər ﷺ): “Bəlkə müsəlmandır!”– dedi. Mən bir az susdum. Nəhayət,

[1] “ət-Tovbə” surəsi, 5.

onun haqqında bildiklərim mənə üstün gəldi və yenə sözümü təkrar edib: “Niyə filankəsi kənarda qoydun? Vallahi ki, mən onu mömin hesab edirəm”– dedim. (Peyğəmbər ﷺ): “Bəlkə müsəlmandır!”– dedi. Mən bir müddət susdum. Amma onun haqqında bildiklərim yenə mənə üstün gəldi və bir daha sözümü təkrar etdim. Peyğəmbər ﷺ də dediyini təkrar söylədikdən sonra mənə buyurdu: “Ey Səd! Bəzən bir adama Allah onu üzüqoylu Oda atmasın deyə hədiyyə verirəm, halbuki başqasını ondan da çox istəyirəm.” (əl-Buxari, 27)

## 17-ci fəsil. Həyat yoldaşına qarşı nankorluq etmək və küfrün altında (başqa növ) küfrün olması

## ١٧– باب: كُفْرَانُ الْعَشِيرِ وَ كُفْرٌ دُونَ كُفْرٍ

٢٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ النَّبِيُّ ﷺ أُرِيتُ النَّارَ فَإِذَا أَكْثَرُ أَهْلِهَا النِّسَاءُ يَكْفُرْنَ قِيلَ أَيَكْفُرْنَ بِاللَّهِ قَالَ يَكْفُرْنَ الْعَشِيرَ وَيَكْفُرْنَ الإِحْسَانَ لَوْ أَحْسَنْتَ إِلَى إِحْدَاهُنَّ الدَّهْرَ ثُمَّ رَأَتْ مِنْكَ شَيْئًا قَالَتْ مَا رَأَيْتُ مِنْكَ خَيْرًا قَطُّ. [رواه البخاري: ٢٩]

**27.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ dedi: “Mənə Cəhənnəm göstərildi. Baxdım ki, onun sakinlərinin əksəriyyəti nankor olan qadınlardır.” Soruşdular: “Allaha qarşı nankordurlarmı?” (Peyğəmbər ﷺ) dedi: “Onlar ərlərinə qarşı nankordurlar, yaxşılığı yerə vururlar. Birisinə il boyu yaxşılıq edirsən, sonra da səndən (xoşuna gəlməyən) bir şey görəndə deyir ki: –Mən səndən heç vaxt xeyir görmədim.” (əl-Buxari, 29)

## 18-ci fəsil. Günah işlər görmək cahillikdən irəli gələn bir şeydir və günah sahibi ta Allaha şərik qoşmayınca, etdiyi günaha görə kafir sayılmaz

## ١٨– باب: الْمَعَاصِي مِنْ أَمْرِ الْجَاهِلِيَّةِ وَ لاَ يُكَفَّرُ صَاحِبُهَا بِارْتِكَابِهَا إِلاَّ بِالشِّرْكِ

٢٨ – عَنْ أَبِي ذَرٍّ رضي الله عنه قَالَ: إِنِّي سَابَبْتُ رَجُلاً فَعَيَّرْتُهُ بِأُمِّهِ فَقَالَ لِي النَّبِيُّ ﷺ يَا أَبَا ذَرٍّ أَعَيَّرْتَهُ بِأُمِّهِ إِنَّكَ امْرُؤٌ فِيكَ جَاهِلِيَّةٌ إِخْوَانُكُمْ خَوَلُكُمْ جَعَلَهُمْ اللَّهُ تَحْتَ أَيْدِيكُمْ فَمَنْ كَانَ أَخُوهُ تَحْتَ يَدِهِ فَلْيُطْعِمْهُ مِمَّا يَأْكُلُ وَلْيُلْبِسْهُ مِمَّا يَلْبَسُ وَلاَ تُكَلِّفُوهُمْ مَا يَغْلِبُهُمْ فَإِنْ كَلَّفْتُمُوهُمْ فَأَعِينُوهُمْ. [رواه البخاري: ٣٠]

**28.** Əbu Zərr رضي الله عنه rəvayət edir ki, mən bir adama nalayiq söz deyib[1] onu anasına görə utandırdım. Peyğəmbər ﷺ mənə buyurdu: “Ey Əbu Zər! Sən onu anasına görə utandırdın? Həqiqətən də, səndə cahiliyyət (əxlaqı) qalmışdır. Kölələriniz sizin qardaşlarınızdır! Allah onları sizin tabeçiliyinizə vermişdir. Kimin qardaşı öz tabeçiliyi altında olsa, yediyindən ona da yedirtsin, geyindiyindən ona da geyindirsin! Onları gücləri çatmadığı bir işlə yükləməyin. Hərgah, onları gücləri çatmadığı bir işlə yükləsəniz, onda onlara yardım edin.” (əl-Buxari, 30)

[1] Başqa rəvayətdə: Ona: “Ey zənci oğlu!”– deyə müraciət etdim.

**19-cu fəsil.** (Uca Allahın): «**Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşarsa, onları dərhal barışdırın**»[1]– sözü

**١٩– باب:**
**﴿ وَإِن طَآئِفَتَانِ مِنَ ٱلْمُؤْمِنِينَ ٱقْتَتَلُوا۟ فَأَصْلِحُوا۟ بَيْنَهُمَا ﴾**

**٢٩** – عَنْ أَبِي بَكْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ إِذَا الْتَقَى الْمُسْلِمَانِ بِسَيْفَيْهِمَا فَالْقَاتِلُ وَالْمَقْتُولُ فِي النَّارِ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ هَذَا الْقَاتِلُ فَمَا بَالُ الْمَقْتُولِ قَالَ إِنَّهُ كَانَ حَرِيصًا عَلَى قَتْلِ صَاحِبِهِ. [رواه البخاري: ٣١]

**29.** Əbu Bəkrə ﷺ demişdir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "İki müsəlman qılınclarını çəkib üz-üzə gələrsə, öldürən də, öldürülən də Cəhənnəmə girər." Dedim: "Ya Rəsulullah! Öldürən aydındır. Bəs öldürülən niyə?" Dedi: "Çünki o, qardaşını öldürməyə həris idi." (əl-Buxari, 31)

**20-ci fəsil.**
**Zülmün altında** (başqa növ) **zülmün olması**

**٢٠– باب:**
**ظُلْمٌ دُونَ ظُلْمٍ**

**٣٠** – عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ﷺ، قَالَ: لَمَّا نَزَلَتْ: ﴿ٱلَّذِينَ ءَامَنُوا۟ وَلَمْ يَلْبِسُوٓا۟ إِيمَـٰنَهُم بِظُلْمٍ﴾ قَالَ أَصْحَابُ رَسُولِ اللهِ ﷺ: أَيُّنَا لَمْ يَظْلِمْ؟ فَأَنْزَلَ اللهُ تَعَالَى: ﴿إِنَّ ٱلشِّرْكَ لَظُلْمٌ عَظِيمٌ﴾ [رواه البخاري: ٣٢]

**30.** Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, **"İman gətirib imanlarına zülm qatmayanlar əmin-amanlıqdadırlar..."**[2] ayəsi nazil olduqda Peyğəmbərin ﷺ əshabələri dedilər: "Bizim hansı birimiz (özünə) zülm etməyib ki?" Uca Allah da bu ayəni nazil etdi: **"Həqiqətən də, Allaha şərik qoşmaq böyük zülmdür!"**[3] (əl-Buxari, 32)

**21-ci fəsil. Münafiqin əlamətləri**

**٢١– باب: عَلَامَاتُ الْمُنَافِقِ**

**٣١** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ قَالَ: آيَةُ الْمُنَافِقِ ثَلَاثٌ إِذَا حَدَّثَ كَذَبَ ، وَإِذَا وَعَدَ أَخْلَفَ ، وَإِذَا اؤْتُمِنَ خَانَ. [رواه البخاري: ٣٣]

**31.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Münafiqin əlaməti üçdür: danışdığı zaman yalan danışar; vəd verdiyi zaman (vədinə) xilaf çıxar; ona əmanət verildiyi zaman xəyanət edər." (əl-Buxari, 33)

**٣٢** – عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ﷺ: أَنَّ النَّبِيَّ صلى الله عليه وسلم قَالَ: أَرْبَعٌ مَنْ كُنَّ فِيهِ كَانَ مُنَافِقًا خَالِصًا ، وَمَنْ كَانَتْ فِيهِ خَصْلَةٌ مِنْهُنَّ كَانَتْ فِيهِ خَصْلَةٌ مِنَ النِّفَاقِ حَتَّى يَدَعَهَا إِذَا اؤْتُمِنَ خَانَ وَإِذَا حَدَّثَ كَذَبَ وَإِذَا عَاهَدَ غَدَرَ ، وَإِذَا خَاصَمَ فَجَرَ. [رواه البخاري: ٣٤]

**32.** Abdullah ibn Amr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Dörd (xislət) vardır ki, bunlar kimdə olsa, əsl münafiq sayılar və hər kimdə bunlardan biri olsa

[1] "əl-Hucurat" surəsi, 9.
[2] "əl-Ən'am" surəsi, 82.
[3] "Loğman" surəsi, 13.

belə, onu tərk edincəyə qədər özündə münafiqlik xisləti qalmış sayılar: ona əmanət verildiyi zaman xəyanət edər; danışdığı zaman yalan danışar; əhd bağladığı zaman (əhdini) pozar; mübahisə etdiyi zaman haqsızlıq edər.” (əl-Buxari, 34)

## 22-ci fəsil. Qədr gecəsində[1] ibadət etmək imandandır

## ٢٢– باب: قِيَامُ لَيْلَةِ الْقَدْرِ مِنَ الإِيْمَانِ

٣٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللهِ ﷺ: مَنْ يَقُمْ لَيْلَةَ الْقَدْرِ، إِيْمَاناً وَ احْتِسَاباً، غُفِرَ لَهُ مَا تَقَدَمَ مِنْ ذَنْبِهِ. [رواه البخاري: ٣٥]

**33.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər kəs Qədr gecəsində imanla, mükafatını (yalnız Allahdan) umaraq ibadət edərsə, keçmiş günahları bağışlanar.” (əl-Buxari, 35)

## 23-cü fəsil. Cihad imandandır

## ٢٣– باب: الْجِهَادُ مِنَ الإِيْمَانِ

٣٤ – عَنْهُ ﷺ، عَنِ النَّبِىِّ ﷺ قَالَ: انْتَدَبَ اللَّهُ لِمَنْ خَرَجَ فِى سَبِيلِهِ لاَ يُخْرِجُهُ إِلاَّ إِيمَانٌ بِى وَتَصْدِيقٌ بِرُسُلِى أَنْ أُرْجِعَهُ بِمَا نَالَ مِنْ أَجْرٍ أَوْ غَنِيمَةٍ ، أَوْ أُدْخِلَهُ الْجَنَّةَ ، وَلَوْلاَ أَنْ أَشُقَّ عَلَى أُمَّتِى مَا قَعَدْتُ خَلْفَ سَرِيَّةٍ ، وَلَوَدِدْتُ أَنِّى أُقْتَلُ فِى سَبِيلِ اللَّهِ ثُمَّ أُحْيَا ، ثُمَّ أُقْتَلُ ثُمَّ أُحْيَا ، ثُمَّ أُقْتَلُ. [رواه البخاري: ٣٦]

**34.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qüdrətli və Böyük Allah Onun yolunda cihada çıxan kimsənin mükafatını tez verər. (Allah buyurar): “Onu (evindən) çıxaran yalnız Mənə olan imanı və elçilərimə olan inamıdır. Mən də onu nail olduğu savab və qənimətlə (sağ-salamat yurduna) qaytaracağam, yaxud Cənnətə daxil edəcəyəm.” Hərgah ümmətimi əziyyətə salmış olmasaydım, (döyüşə gedən) dəstənin arxasında qalmazdım və Allah yolunda öldürülüb sonra dirildilməyimi, sonra öldürülüb yenə dirildilməyimi, sonra mütləq yenə öldürülməyimi istərdim.” (əl-Buxari, 36)

## 24-cü fəsil. Ramazan gecələrində nafilə namazları qılmaq imandandır

## ٢٤– باب: تَطَوُّعُ قِيَامِ رَمَضَانَ مِنَ الإِيْمَانِ

٣٥ – عَنْهُ ﷺ قَالَ: قَالَ رَسُولُ اللهِ ﷺ: مَنْ قَامَ رَمَضَانَ، إِيْمَاناً وَاحْتِسَاباً، غُفِرَ لَهُ مَا تَقَدَمَ مِنْ ذَنْبِهِ. [رواه البخاري: ٣٧]

**35.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim Ramazan gecələrində imanla, mükafatını (yalnız Allahdan) umaraq nafilə namazları qılsa, keçmiş günahları bağışlanar.” (əl-Buxari, 37)

[1] Ramazan ayının son on günündəki tək gecələrdən biri. Müqəddəs Quranda deyilir ki, bu gecə, belə gecənin olmadığı min aydan üstündür, yəni əgər mömin bu gecə ərzində Allaha ibadətlə məşğul olsa o, min ay ərzində Allaha edəcəyi ibadətə görə qazanacağı mükafatdan daha böyük mükafat qazanar.

## 25-ci fəsil. Ramazan ayını mükafatını (yalnız Allahdan ﷻ) umaraq oruc tutmaq imandandır

## ٢٥– باب: صَوْمُ رَمَضَانَ احْتِسَاباً مِنَ الإِيْمَانِ

٣٦ – عَنْهُ ﷺ قَالَ: قَالَ رَسُولُ اللهِ ﷺ: مَنْ صَامَ رَمَضَانَ، إِيْمَاناً وَ احْتِسَاباً، غُفِرَ لَهُ مَا تَقَدَمَ مِنْ ذَنْبِهِ. [رواه البخاري: ٣٨]

**36.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Ramazan ayını imanla, mükafatını (yalnız Allahdan) umaraq oruc tutarsa, keçmiş günahları bağışlanar." (əl-Buxari, 38)

## 26-cı fəsil. Din asandır

## ٢٦– باب: الدِّيْنُ يُسْرٌ

٣٧ – عَنْهُ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: إِنَّ الدِّينَ يُسْرٌ، وَلَنْ يُشَادَّ الدِّينَ أَحَدٌ إِلاَّ غَلَبَهُ، فَسَدِّدُوا وَقَارِبُوا وَأَبْشِرُوا، وَاسْتَعِينُوا بِالْغَدْوَةِ وَالرَّوْحَةِ وَشَيْءٍ مِنَ الدُّلْجَة [رواه البخاري: ٣٩]

**37.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həqiqətən, din asandır. Dini çətinləşdirən elə bir kimsə yoxdur ki, (din) onu üstələməsin. Elə isə doğru yol tutun, (ən kamil olanı yerinə yetirə bilməsəniz, heç olmasa ona) yaxınlaşın, (qazandığınız savaba) sevinin, səhər, axşam və gecənin bir vaxtında (Allahdan) kömək diləyin." (əl-Buxari, 39)

## 27-ci fəsil. Namaz qılmaq imandandır

## ٢٧– باب: الصَّلاَةُ مِنَ الإِيْمَانِ

٣٨ – عَنْ الْبَرَاء ﷺ، أَنَّ النَّبِيَّ ﷺ كَانَ أَوَّلَ مَا قَدِمَ الْمَدِينَةَ نَزَلَ عَلَى أَجْدَادِه – أَوْ قَالَ أَخْوَالِه – مِنَ الأَنْصَارِ، وَأَنَّهُ صَلَّى قِبَلَ بَيْتِ الْمَقْدِسِ سِتَّةَ عَشَرَ شَهْرًا، أَوْ سَبْعَةَ عَشَرَ شَهْرًا، وَكَانَ يُعْجِبُهُ أَنْ تَكُونَ قِبْلَتُهُ قِبَلَ الْبَيْتِ، وَأَنَّهُ صَلَّى أَوَّلَ صَلاَةٍ صَلاَّهَا صَلاَةَ الْعَصْرِ، وَصَلَّى مَعَهُ قَوْمٌ ، فَخَرَجَ رَجُلٌ مِمَّنْ صَلَّى مَعَهُ، فَمَرَّ عَلَى أَهْلِ مَسْجِد، وَهُمْ رَاكِعُونَ فَقَالَ أَشْهَدُ بِاللَّه لَقَدْ صَلَّيْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ قِبَلَ مَكَّةَ، فَدَارُوا كَمَا هُمْ قِبَلَ الْبَيْتِ، وَكَانَتِ الْيَهُودُ قَدْ أَعْجَبَهُمْ إِذْ كَانَ يُصَلِّي قِبَلَ بَيْتِ الْمَقْدِسِ، وَأَهْلُ الْكِتَابِ، فَلَمَّا وَلَّى وَجْهَهُ قِبَلَ الْبَيْتِ أَنْكَرُوا ذَلِكَ. [رواه البخاري: ٤٠]

**38.** əl-Bəra (ibn Azib) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Mədinəyə[1] gəldikdə ilk əvvəl ənsardan olan babalarının (və ya dayılarının) yanında qaldı və on altı, yaxud on yeddi ay Beytul-Məqdisə[2] doğru namaz qıldı. Halbuki, qibləsinin[3] Kəbəyə[4] doğru olmasını arzu edirdi. Peyğəmbərin ﷺ (Kəbəyə doğru) qıldığı ilk

---

[1] əl-Mədinə – Səudiyyə Ərəbistanında şəhər. Müsəlmanların müqəddəs ziyarətgahı olan Muhəmməd Peyğəmbərin ﷺ məscidi orada yerləşir. Muhəmməd Peyğəmbər ﷺ və onun əshabələri məhz bu şəhərə hicrət etmişlər. İslamdan əvvəlki zamanlarda şəhər Yəsrib adlanırdı.

[2] Beytül-Məqdis – Qüdsdə yerləşən məsciddir.

[3] Namaz qılınarkən və bir sıra digər ibadət ayinlərinin icra edildiyi vaxtlarda müsəlmanların üzlərini çevirdikləri, Məkkə şəhərindəki Məscidülhəramda yerləşən Kəbəyə olan istiqamət. İslamın yayıldığı ilk dönəmdə qiblə Beytul-Məqdis idi.

[4] Kəbə – İbrahim ﷺ və onun oğlu İsmail ﷺ peyğəmbərin ucaltdığı kub formasında daş tikili. O, Allaha ibadət etmək üçün yer üzündə tikilən ilk məbəd olmuşdur. Bütün müsəlmanlar namaz qılarkən üzlərini ona doğru çevirirlər. Hər il milyonlarla müsəlman yaşadığı ölkədən Məkkəyə gələrək onu ziyarət edir, qədim ibadətgahın ətrafına dolanırlar.

namaz əsr namazı oldu. Bir camaat da onunla birlikdə namaz qıldı. Sonra onunla birlikdə namaz qılanlardan biri çıxıb getdi və məscidlərin birində rükuya getmiş bir camaatın yanından keçərkən dedi: “Allahı şahid gətirirəm ki, mən Peyğəmbərlə ﷺ birgə Məkkəyə[1] doğru namaz qıldım.” (Camaat bunu eşidən kimi) olduğu vəziyyətdə Kəbəyə tərəf döndü.

Yəhudilər və xristianlar Peyğəmbərin ﷺ Beytul-Məqdisə tərəf namaz qılmağını bəyənirdilər. Elə ki o, üzünü Kəbəyə tərəf döndərdi, bu onların xoşuna gəlmədi. (əl-Buxari, 40)

## 28-ci fəsil. Kişinin İslamının gözəlliyi

## ٢٨– باب: حُسْنُ إِسْلاَمِ الْمَرْءِ

٣٩ – عَنْ أَبِي سَعِيدِ الْخُدْرِي رضي الله عنه أَنَّهُ سَمِعَ رَسُولَ اللَّه ﷺ يَقُولُ: إِذَا أَسْلَمَ الْعَبْدُ فَحَسُنَ إِسْلاَمُهُ يُكَفِّرُ اللَّهُ عَنْهُ كُلَّ سَيِّئَة كَانَ زَلَفَهَا، وَكَانَ بَعْدَ ذَلِكَ الْقِصَاصُ، الْحَسَنَةُ بِعَشْرِ أَمْثَالِهَا إِلَى سَبْعِمِائَةِ ضِعْفٍ، وَالسَّيِّئَةُ بِمِثْلِهَا إِلاَّ أَنْ يَتَجَاوَزَ اللَّهُ عَنْهَا. [رواه البخاري: ٤١]

**39.** Əbu Səid əl-Xudri رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Bir bəndə müsəlman olub İslamı gözəl yaşayarsa, Allah onun keçmişdə etdiyi hər bir günahını bağışlayar. Bundan sonra isə (edəcəyi əməllərin) əvəzini alar: hər yaxşılığa, onun on mislindən ta yeddi yüz qatınadək (əvəz verilər); hər pisliyə isə yalnız öz misli qədər (cəza verilər). Yalnız Allahın bunu bağışlaması istisnadır.” (əl-Buxari, 41)

## 29-cu fəsil. Allaha عز وجل ən sevimli olan din (əməl) davamiyyətli olanıdır

## ٢٩– باب: أَحَبُّ الدِّيْنِ إِلَى اللهِ أَدْوَمُهُ

٤٠ – عَنْ عَائِشَةَ رضي الله عنها: أَنَّ النَّبِيَّ ﷺ دَخَلَ عَلَيْهَا وَعِنْدَهَا امْرَأَةٌ قَالَ: «مَنْ هٰذِه» . قَالَتْ فُلاَنَةُ. تَذْكُرُ مِنْ صَلاَتِهَا. قَالَ: «مَهْ، عَلَيْكُمْ بِمَا تُطِيقُونَ، فَوَاللَّهِ لاَ يَمَلُّ اللَّهُ حَتَّى تَمَلُّوا». وَكَانَ أَحَبَّ الدِّينِ إِلَيْهِ مَا دَامَ عَلَيْهِ صَاحِبُهُ. [رواه البخاري: ٤٣]

**40.** Aişə رضي الله عنها rəvayət edir ki, yanında bir qadın olarkən Peyğəmbər ﷺ içəri daxil olub: “Bu kimdir?”– deyə soruşdu. (Aişə): “Filankəsdir”– deyib, onun namaz qılmağından danışdı. Peyğəmbər ﷺ buyurdu: “Bəsdir, siz bacardığınızı yerinə yetirməlisiniz. Vallahi, siz usanmadıqca, Allah usanmaz.”

Aişə رضي الله عنها demişdir: “Allah üçün ibadətlərin ən sevimlisi o əməldir ki, insan onu davamlı yerinə yetirir.” (əl-Buxari, 43)

## 30-cu fəsil. İmanın artması və azalması

## ٣٠– باب: زِيَادَةُ الإِيْمَانِ وَ نُقْصَانُهُ

٤١ – عَنْ أَنَسٍ رضي الله عنه، عَنِ النَّبِيِّ ﷺ قَالَ: يَخْرُجُ مِنَ النَّارِ مَنْ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَفِى قَلْبِهِ وَزْنُ شَعِيرَةٍ مِنْ خَيْرٍ، وَيَخْرُجُ مِنَ النَّارِ مَنْ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَفِى قَلْبِهِ وَزْنُ بُرَّةٍ مِنْ خَيْرٍ، وَيَخْرُجُ مِنَ النَّارِ مَنْ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَفِى قَلْبِهِ وَزْنُ ذَرَّةٍ مِنْ خَيْرٍ. [رواه البخاري: ٤٤]

---

[1] Səudiyyə Ərəbistanında şəhərdir. Müsəlmanların ən müqəddəs yeri olan Kəbə bu şəhərdə yerləşir. Şəhərin əsası İsmail peyğəmbərin عليه السلام dövründə qoyulmuşdur. Muhəmməd Peyğəmbər ﷺ də orada anadan olmuş və buradan İslamı yaymağa başlamışdır.

**41.** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qəlbində arpa dənəsi ağırlığında iman ola-ola “Allahdan başqa (haqq) məbud yoxdur!”[1] – deyən kəs Cəhənnəmdən çıxacaqdır. Qəlbində buğda dənəsi ağırlığında iman ola-ola “Allahdan başqa (haqq) məbud yoxdur!”– deyən kəs Cəhənnəmdən çıxacaqdır. Qəlbində zərrə ağırlığında iman ola-ola “Allahdan başqa (haqq) məbud yoxdur!”– deyən kəs Cəhənnəmdən çıxacaqdır.” (əl-Buxari, 44)

**٤٢** – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ ﵁ أَنَّ رَجُلاً مِنَ الْيَهُودِ قَالَ لَهُ يَا أَمِيرَ الْمُؤْمِنِينَ، آيَةٌ فِى كِتَابِكُمْ تَقْرَءُونَهَا لَوْ عَلَيْنَا مَعْشَرَ الْيَهُودِ نَزَلَتْ لاَتَّخَذْنَا ذَلِكَ الْيَوْمَ عِيدًا. قَالَ أَىُّ آيَةٍ قَالَ: ﴿ٱلْيَوْمَ أَكْمَلْتُ لَكُمْ دِينَكُمْ وَأَتْمَمْتُ عَلَيْكُمْ نِعْمَتِى وَرَضِيتُ لَكُمُ ٱلْإِسْلَٰمَ دِينًاۚ﴾ قَالَ عُمَرُ قَدْ عَرَفْنَا ذَلِكَ الْيَوْمَ وَالْمَكَانَ الَّذِى نَزَلَتْ فِيهِ عَلَى النَّبِىِّ ﷺ وَهُوَ قَائِمٌ بِعَرَفَةَ يَوْمَ جُمُعَةٍ. [رواه البخاري: ٤٥]

**42.** Ömər ibn Xəttab ﵁ rəvayət edir ki, bir yəhudi ona belə dedi: “Ey möminlərin əmiri! Sizin Kitabınızda oxuduğunuz elə bir ayə vardır ki, o, biz yəhudilərə nazil olsaydı, həmin günü bayram edərdik.” Ömər ﵁: “Hansı ayədir o?”– deyə soruşdu. (Yəhudi): **“Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və din olaraq sizin üçün İslamı bəyənib seçdim”**[2] ayəsidir deyə cavab verdi. Ömər ﵁ dedi: “Biz bu ayənin nazil olduğu günü də, yeri də bilirik. Bu ayə Peyğəmbərə ﷺ cümə günü, Ərəfatda[3] nazil olmuşdur.” (əl-Buxari, 45)

## 31-ci fəsil. Zəkat İslamdandır

## ٣١– باب: الزَّكَاةُ مِنَ الإِسْلاَمِ

**٤٣** – عَنْ طَلْحَةَ بْنِ عُبَيْدِ اللهِ ﵁ يَقُولُ: جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللَّهِ ﷺ مِنْ أَهْلِ نَجْدٍ، ثَائِرُ الرَّأْسِ، يُسْمَعُ دَوِىُّ صَوْتِهِ، وَلاَ يُفْقَهُ مَا يَقُولُ حَتَّى دَنَا، فَإِذَا هُوَ يَسْأَلُ عَنِ الإِسْلاَمِ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «خَمْسُ صَلَوَاتٍ فِى الْيَوْمِ وَاللَّيْلَةِ». فَقَالَ هَلْ عَلَىَّ غَيْرُهَا، قَالَ: «لاَ، إِلاَّ أَنْ تَطَوَّعَ». قَالَ رَسُولُ اللَّهِ ﷺ «وَصِيَامُ رَمَضَانَ». قَالَ هَلْ عَلَىَّ غَيْرُهُ، قَالَ: «لاَ، إِلاَّ أَنْ تَطَوَّعَ». قَالَ وَذَكَرَ لَهُ رَسُولُ اللَّهِ ﷺ الزَّكَاةَ. قَالَ هَلْ عَلَىَّ غَيْرُهَا، قَالَ: «لاَ، إِلاَّ أَنْ تَطَوَّعَ». قَالَ فَأَدْبَرَ الرَّجُلُ وَهُوَ يَقُولُ وَاللَّهِ لاَ أَزِيدُ عَلَى هَذَا وَلاَ أَنْقُصُ. قَالَ رَسُولُ اللَّهِ ﷺ «أَفْلَحَ إِنْ صَدَقَ» [رواه البخاري: ٤٦]

**43.** Təlhə ibn Ubeydullah ﵁ rəvayət edir ki, Nəcd[4] əhlindən olan, saçları dağınıq bir kişi Peyğəmbərin ﷺ yanına gəldi. Biz uzaqdan onun gurultulu səsini eşidir, amma nə dediyini anlamırdıq. Nəhayət, yaxına gəldi və aydın oldu ki, İslam barəsində soruşur. Peyğəmbər ﷺ buyurdu: “Bir gün və bir gecə ərzində beş vaxt namaz (qılmalısan).” Kişi soruşdu: “Mənə bundan başqası vacib buyrulubmu?” (Peyğəmbər ﷺ): “Xeyr! Yalnız könüllü olaraq qıldığından başqa”– deyə cavab verdi. Sonra Peyğəmbər ﷺ buyurdu: “Ramazan orucunu da (tutmalısan).” (Kişi) soruşdu: “Mənə bundan başqası vacib buyrulubmu?” (Peyğəmbər ﷺ): “Xeyr! Yalnız könüllü olaraq tutduğundan başqa”– deyə cavab verdi. Peyğəmbər ﷺ ona zəkatın vacibliyini də bildirdi. (Kişi) soruşdu: “Mənə bundan başqası vacib buyrulubmu?” (Peyğəmbər ﷺ): “Xeyr! Yalnız könüllü olaraq

[1] Transkripsiyası: “La ilahə illəllah”.
[2] “əl-Maidə” surəsi, 3.
[3] Məkkədən 25 km aralıda yerləşən vahə. Zülhiccə ayının doqquzuncu günü zəvvarlar orada qalırlar.
[4] Məkkə ilə İraq arasında olan ərazilər.

verdiyindən başqa"– deyə cavab verdi. Kişi: "Vallahi ki, mən buna heç nə artırmayacağam və heç nə əskiltməyəcəyəm"– dedi və dönüb getdi. Peyğəmbər ﷺ buyurdu: "Əgər doğru deyirsə, nicat tapacaqdır." (əl-Buxari, 46)

## 32-ci fəsil. Cənazənin ardınca getmək imandandır

## ٣٢– باب: اِتِّبَاعُ الْجَنَائِزِ مِنَ الإِيْمانِ

٤٤ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه: أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَنِ اتَّبَعَ جَنَازَةَ مُسْلِمٍ إِيمَانًا وَاحْتِسَابًا، وَكَانَ مَعَهُ حَتَّى يُصَلَّى عَلَيْهَا، وَيَفْرُغَ مِنْ دَفْنِهَا ، فَإِنَّهُ يَرْجِعُ مِنَ الأَجْرِ بِقِيرَاطَيْنِ، كُلُّ قِيرَاطٍ مِثْلُ أُحُدٍ، وَمَنْ صَلَّى عَلَيْهَا ثُمَّ رَجَعَ قَبْلَ أَنْ تُدْفَنَ فَإِنَّهُ يَرْجِعُ بِقِيرَاطٍ. [رواه البخاري: ٤٧]

**44.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim imanla, mükafatını (yalnız Allahdan) umaraq cənazənin ardınca getsə, namazını qılıb dəfn edilənədək yanında qalsa, iki qirat[1] savabla geri qayıdar ki, qiratların hər biri Uhud dağı boyda olar. Kim cənazə namazı qılıb dəfn edilməmişdən əvvəl geri qayıtsa, bir qiratla geri qayıtmış olar." (əl-Buxari, 47)

## 33-cü fəsil. Möminin özü də hiss etmədən əməlinin puç olmağından qorxması

## ٣٣– باب: خَوْفُ الْمُؤْمِنِ مِنْ أَنْ يَحْبَطَ عَمَلُهُ وَ هُوَ لاَ يَشْعُرُ

٤٥ – عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ رضي الله عنه: أَنَّ رَسُولَ اللهِ ﷺ قَالَ: «سِبَابُ الْمُسْلِمِ فُسُوقٌ وَ قِتَالُهُ كُفْرٌ» [رواه البخاري: ٤٨]

**45.** Abdullah ibn Məsuddan رضي الله عنه rəvayət edilmişdir ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlmanı söymək günah, ona qarşı vuruşmaq isə küfrdür." (əl-Buxari, 48)

٤٦ – عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ رضي الله عنه: أَنَّ رَسُولَ اللَّهِ ﷺ خَرَجَ يُخْبِرُ بِلَيْلَةِ الْقَدْرِ، فَتَلاَحَى رَجُلاَنِ مِنَ الْمُسْلِمِينَ فَقَالَ: «إِنِّي خَرَجْتُ لأُخْبِرَكُمْ بِلَيْلَةِ الْقَدْرِ، وَإِنَّهُ تَلاَحَى فُلاَنٌ وَفُلاَنٌ فَرُفِعَتْ وَعَسَى أَنْ يَكُونَ خَيْرًا لَكُمُ الْتَمِسُوهَا فِي السَّبْعِ وَالتِّسْعِ وَالْخَمْسِ». [رواه البخاري: ٤٩]

**46.** Ubadə ibn Samit رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ Qədr gecəsini xəbər vermək üçün (evindən) çıxdı. Bu vaxt müsəlmanlardan iki nəfər çənə-boğaz edirdilər. Peyğəmbər ﷺ dedi: "Mən sizə Qədr gecəsini xəbər vermək üçün çıxdım. Filankəslə filankəs mübahisə etdiklərinə görə (bu bilgi) qeyb oldu. Bəlkə də, bu sizin xeyrinizədir. Elə isə onu (iyirmi) yeddinci, (iyirmi) doqquzuncu və (iyirmi) beşinci günlərdə axtarın." (əl-Buxari, 49)

## 34-cü fəsil. Cəbrailin عليه السلام Peyğəmbərə ﷺ iman, islam və ehsan barədə sual verməsi

## ٣٤– باب: سُؤَالُ جِبْرِيلَ النَّبِيَّ ﷺ عَنِ الإِيْمَانِ وَ الإِسْلاَمِ وَ الإِحْسَانِ ...

٤٧ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: كَانَ النَّبِيُّ ﷺ بَارِزًا يَوْمًا لِلنَّاسِ، فَأَتَاهُ رَجُلٌ فَقَالَ مَا الإِيمَانُ؟ قَالَ: «الإِيمَانُ أَنْ تُؤْمِنَ بِاللَّهِ وَمَلاَئِكَتِهِ وَبِلِقَائِهِ وَرُسُلِهِ، وَتُؤْمِنَ بِالْبَعْثِ». قَالَ مَا الإِسْلاَمُ؟ قَالَ: «الإِسْلاَمُ أَنْ تَعْبُدَ اللَّهَ وَلاَ تُشْرِكَ بِهِ،

[1] Qirat: ölçü vahididir.

وَتُقِيمَ الصَّلاَةَ، وَتُؤَدِّىَ الزَّكَاةَ الْمَفْرُوضَةَ، وَتَصُومَ رَمَضَانَ». قَالَ: مَا الإِحْسَانُ؟ قَالَ: «أَنْ تَعْبُدَ اللَّهَ كَأَنَّكَ تَرَاهُ، فَإِنْ لَمْ تَكُنْ تَرَاهُ فَإِنَّهُ يَرَاكَ». قَالَ: مَتَى السَّاعَةُ؟ قَالَ: «مَا الْمَسْئُولُ عَنْهَا بِأَعْلَمَ مِنَ السَّائِلِ، وَسَأُخْبِرُكَ عَنْ أَشْرَاطِهَا إِذَا وَلَدَتِ الأَمَةُ رَبَّهَا، وَإِذَا تَطَاوَلَ رُعَاةُ الإِبِلِ الْبُهْمُ فِى الْبُنْيَانِ، فِى خَمْسٍ لاَ يَعْلَمُهُنَّ إِلاَّ اللَّهُ». ثُمَّ تَلاَ النَّبِىُّ ﷺ ﴿إِنَّ ٱللَّهَ عِندَهُۥ عِلْمُ ٱلسَّاعَةِ﴾ الآيَةَ. ثُمَّ أَدْبَرَ فَقَالَ: «رُدُّوهُ». فَلَمْ يَرَوْا شَيْئًا. فَقَالَ: «هَذَا جِبْرِيلُ جَاءَ يُعَلِّمُ النَّاسَ دِينَهُمْ». [رواه البخاري: ٥٠]

**47.** Əbu Hureyra ﷛ rəvayət edir ki, bir gün Peyğəmbər ﷺ camaatın arasında oturmuşdu. Bir nəfər onun yanına gəlib: "İman nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "İman (odur ki,) Allaha, Onun mələklərinə, Onunla qarşılaşacağına və Onun elçilərinə iman gətirəsən, habelə (öldükdən sonra) diriləcəyinə inanasan." O: "İslam nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "İslam (odur ki,) Allaha ibadət edib Ona (heç bir şeyi) şərik qoşmayasan, (vaxtlı-vaxtında, lazımınca) namaz qılasan, vacib buyrulmuş zəkatı verəsən və Ramazan ayını oruc tutasan." O: "Ehsan nədir?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Ehsan (odur ki,) Allaha, sanki Onu görürmüşsən kimi ibadət edəsən; sən Onu görməsən də, (bil ki,) O, səni görür." O: "Qiyamət nə zaman qopacaq?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Bu haqda soruşulan soruşandan çox bilmir. Lakin sənə Qiyamətin əlamətlərini deyəcəyəm: kəniz öz ağasını doğacağı və kimliyi bəlli olmayan, dəvə otaran çobanlar hündür binalar tikməkdə bir-biri ilə yarışacaqları zaman (Qiyamət qopacaqdır. Bu da) yalnız Allahın bildiyi beş şeydən biridir." Sonra Peyğəmbər ﷺ: **"Həqiqətən, Saatı** (Qiyamətin qopacağı vaxtı) **ancaq Allah bilir. Yağışı** (istədiyi vaxt) **göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə qazanacağını bilməz. Heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki,** (hər şeyi) **Biləndir,** (hər şeydən) **Xəbərdardır!"**[1] ayəsini oxudu. Sonra o adam dönüb getdi. Peyğəmbər ﷺ: "Onu geri qaytarın!"– deyə buyurdu. Lakin (əshabələr) ondan bir əsər-əlamət görmədilər. Peyğəmbər ﷺ buyurdu: "Bu Cəbrail idi. İnsanlara dinlərini öyrətmək üçün gəlmişdi." (əl-Buxari, 50)

## 35-ci fəsil. Dininə görə (şübhəli şeylərdən) çəkinən kimsənin fəziləti

## ٣٥– باب: فَضْلُ مَنِ اسْتَبْرَأَ لِدِينِهِ

٤٨ – عَنْ النُّعْمَانَ بْنِ بَشِيرٍ رضي الله عنهما قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «الْحَلاَلُ بَيِّنٌ وَالْحَرَامُ بَيِّنٌ، وَبَيْنَهُمَا مُشَبَّهَاتٌ لاَ يَعْلَمُهَا كَثِيرٌ مِنَ النَّاسِ، فَمَنِ اتَّقَى الْمُشَبَّهَاتِ اسْتَبْرَأَ لِدِينِهِ وَعِرْضِهِ، وَمَنْ وَقَعَ فِى الشُّبُهَاتِ كَرَاعٍ يَرْعَى حَوْلَ الْحِمَى، يُوشِكُ أَنْ يُوَاقِعَهُ. أَلاَ وَإِنَّ لِكُلِّ مَلِكٍ حِمًى، أَلاَ إِنَّ حِمَى اللَّهِ فِى أَرْضِهِ مَحَارِمُهُ، أَلاَ وَإِنَّ فِى الْجَسَدِ مُضْغَةً إِذَا صَلَحَتْ صَلَحَ الْجَسَدُ كُلُّهُ، وَإِذَا فَسَدَتْ فَسَدَ الْجَسَدُ كُلُّهُ. أَلاَ وَهِىَ الْقَلْبُ». [رواه البخاري: ٥٢]

**48.** Nomən ibn Bəşir ﷛ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Halal da bəllidir, haram da. Bunların arasında (halal yaxud haram olduğu bəlli olmayan bəzi) şübhəli şeylər vardır ki, çox insanlar bunu bilməzlər. Kim

[1] "Loğman" surəsi, 34.

şübhəli şeylərdən çəkinsə, dinini və namusunu qorumuş olar. Kim şübhəli şeylərə dalsa, (mal-qarasını) qoruğun kənarında otaran çoban kimi, çox keçməz qoruğa düşər. Bilin ki, hər bir hökmdarın qoruğu vardır. Bilin ki, Allahın yer üzündəki qoruğu haram buyurduğu şeylərdir. Diqqət edin! Bədəndə bir ət parçası vardır. Əgər o yaxşı olarsa, bütün bədən yaxşı olar, yox əgər korlanarsa, bütün bədən korlanar. Bilin ki, o (ət parçası) qəlbdir." (əl-Buxari, 52)

## 36-cı fəsil. Qənimətin beşdə birini vermək imandandır

## ٣٦– باب: أَدَاءُ الْخُمْسِ مِنَ الإِيمَانِ

٤٩ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: إِنَّ وَفْدَ عَبْدِ الْقَيْسِ لَمَّا أَتَوُا النَّبِىَّ ﷺ قَالَ: «مَنِ الْقَوْمُ أَوْ مَنِ الْوَفْدُ». قَالُوا رَبِيعَةُ. قَالَ: «مَرْحَبًا بِالْقَوْمِ – أَوْ بِالْوَفْدِ – غَيْرَ خَزَايَا وَلاَ نَدَامَى». فَقَالُوا يَا رَسُولَ اللَّه، إِنَّا لاَ نَسْتَطِيعُ أَنْ نَأْتِيَكَ إِلاَّ فِى شَهْرِ الْحَرَامِ، وَبَيْنَنَا وَبَيْنَكَ هَذَا الْحَىُّ مِنْ كُفَّارِ مُضَرَ، فَمُرْنَا بِأَمْرٍ فَصْلٍ، نُخْبِرْ بِهِ مَنْ وَرَاءَنَا، وَنَدْخُلْ بِهِ الْجَنَّةَ. وَسَأَلُوهُ عَنِ الأَشْرِبَةِ. فَأَمَرَهُمْ بِأَرْبَعٍ، وَنَهَاهُمْ عَنْ أَرْبَعٍ، أَمَرَهُمْ بِالإِيمَانِ بِاللَّه وَحْدَهُ. قَالَ: «أَتَدْرُونَ مَا الإِيمَانُ بِاللَّه وَحْدَهُ». قَالُوا اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: «شَهَادَةُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّه، وَإِقَامُ الصَّلاَةِ، وَإِيتَاءُ الزَّكَاةِ، وَصِيَامُ رَمَضَانَ، وَأَنْ تُعْطُوا مِنَ الْمَغْنَمِ الْخُمُسَ». وَنَهَاهُمْ عَنْ أَرْبَعٍ عَنِ الْحَنْتَمِ وَالدُّبَّاءِ وَالنَّقِيرِ وَالْمُزَفَّتِ. وَرُبَّمَا قَالَ الْمُقَيَّرِ. وَقَالَ: «احْفَظُوهُنَّ وَأَخْبِرُوا بِهِنَّ مَنْ وَرَاءَكُمْ». [رواه البخاري: ٥٣]

**49.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Abdul-Qeys (qəbiləsinin) nümayəndələri Peyğəmbərin ﷺ yanına gəldikdə o: "Siz kimlərdənsiniz?"– deyə soruşdu. Onlar: "Rabiy'a (qəbiləsindənik)"– deyə cavab verdilər. (Peyğəmbər ﷺ) buyurdu: "Xoş gəlmişsiniz! Allah sizi utandırmasın, peşman eləməsin!" Onlar dedilər: "Ya Rəsulullah! Biz sənin yanına yalnız haram ayda gələ bilirik. Səninlə bizim aramızda Mudar qəbiləsinin kafirləri vardır. Odur ki, bizə (haqqı batildən ayırd edən) bəlli bir şey əmr et ki, onu geridə qalanlarımıza xəbər verək, onun sayəsində Cənnətə girək." Onlar Peyğəmbərdən ﷺ içkilər barədə də soruşdular. Peyğəmbər ﷺ onlara dörd şeyi əmr etdi, dörd şeyi qadağan etdi. Onlara Tək Allaha iman gətirməyi əmr etdikdən sonra soruşdu: "Bilirsinizmi, Tək Allaha iman gətirmək nə deməkdir?" Onlar: "Allah və Onun rəsulu daha yaxşı bilir!"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "(Bu) – şəriki olmayan Tək Allahdan başqa (ibadətə haqqı olan) heç bir məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət vermək, namaz qılmaq, zəkat vermək, Ramazan orucunu tutmaq və qənimətlərdən beşdə birini (xüms[1]) verməyinizdir." (Peyğəmbər ﷺ) onlara dörd şeyi – həntəmi[2], dubbanı[3], nəqiri[4] və müzəffəti (yaxud müqəyyəri)[5] qadağan etdi. Sonra dedi: "Buyurduqlarımı yadda saxlayın və bunları özünüzdən sonra gələnlərə xəbər verin." (əl-Buxari, 53)

---

[1] Xüms – hərbi qənimətlərin beşdə bir hissəsi. Bu bir hissə yenə də beş hissəyə bölünür və sonra onun beşdə bir hissəsi müsəlman hökmdarının əlində qalır, qalan beşdə dörd hissə isə Quran bölgüsünə uyğun olaraq Muhəmməd Peyğəmbərin ﷺ qohumları – Haşimin zürriyyəti, yetimlər, kasıblar və ehtiyac içində olan müsafirlər arasında paylanır.

[2] Həntəm – tərkibinə yun və qan qatılmış gildən düzəldilmiş yaşıl rəngli cürdək. Əvvəllər bu cür qablarda şərab saxlayardılar.

[3] Dubba – şərab saxlamaq üçün qurudulmuş boranıdan düzəldilmiş qab.

[4] Nəqir – şərab saxlamaq üçün içi oyulmuş xurma kötüyündən düzəldilmiş qab.

[5] Müzəffət, yaxud müqəyyər – şərab saxlamaq üçün yanları qatranla malalanmış qab.

## ٣٧– باب: مَا جَاءَ أَنَّ الأَعْمَالَ بِالنِّيَّةِ

## 37-ci fəsil. Əməllərin ancaq niyyətə görə mötəbər sayılacağı barədə varid olan hədis

٥٠ – عَنْ عُمَرَ ﵁، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «الأَعْمَالُ بالنِّيَّة، وَلِكُلِّ امْرِئٍ مَا نَوَى، فَمَنْ كَانَتْ هِجْرَتُهُ إِلَى اللَّهِ وَرَسُولِه، فَهِجْرَتُهُ إِلَى اللَّهِ وَرَسُولِهِ، وَمَنْ كَانَتْ هِجْرَتُهُ لِدُنْيَا يُصِيبُهَا، أَوِ امْرَأَةٍ يَتَزَوَّجُهَا، فَهِجْرَتُهُ إِلَى مَا هَاجَرَ إِلَيْهِ» [رواه البخاري: ٥٤]

**50.** Ömər ibn Xəttab ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əməllər ancaq niyyətlərə görədir. Hər kəsə də yalnız niyyət etdiyi şey qalacaqdır. Kimin hicrəti Allah və Onun elçisi üçündürsə, onun hicrəti Allah və Onun elçisi üçündür. Kimin də hicrəti əldə edəcəyi dünya (malından) və ya evlənəcəyi qadından ötrüdürsə, onun hicrəti hicrət etdiyi şeyə aiddir." (əl-Buxari, 54)

٥١ – عَنْ أَبِي مَسْعُودٍ ﵁، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا أَنْفَقَ الرَّجُلُ عَلَى أَهْلِهِ يَحْتَسِبُهَا فَهُوَ لَهُ صَدَقَةٌ». [رواه البخاري: ٥٥]

**51.** Əbu Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir adam savabını (yalnız Allahdan) umaraq varından ailəsinə xərcləsə, bu onun üçün sədəqə olar." (əl-Buxari, 55)

## ٣٨– باب: قَوْلُ النَّبِيِّ ﷺ: ﴿ الدِّينُ النَّصِيحَةُ ﴾

## 38-ci fəsil. Peyğəmbərin ﷺ: «Din nəsihətdir!»– sözü

٥٢ – عَنْ جَرِيرِ بْنِ عَبْدِ اللهِ الْبَجَلِيِّ ﵁ قَالَ: بَايَعْتُ رَسُولَ اللَّهِ ﷺ عَلَى إِقَامِ الصَّلاَةِ، وَإِيتَاءِ الزَّكَاةِ، وَالنُّصْحِ لِكُلِّ مُسْلِمٍ. [رواه البخاري: ٥٧]

**52.** Cərir ibn Abdullah əl-Bəcəli ﵁ rəvayət edir ki, mən namaz qılacağıma, zəkat verəcəyimə və hər bir müsəlmana nəsihət edəcəyimə dair Peyğəmbərə ﷺ beyət etdim. (əl-Buxari, 57)

٥٣ – عَنْهُ ﵁ قَالَ: فَإِنِّى أَتَيْتُ النَّبِىَّ ﷺ قُلْتُ أُبَايِعُكَ عَلَى الإِسْلاَمِ. فَشَرَطَ عَلَيَّ وَالنُّصْحِ لِكُلِّ مُسْلِمٍ. فَبَايَعْتُهُ عَلَى هَذَا. [رواه البخاري: ٥٨]

**53.** Cərir ibn Abdullah əl-Bəcəli ﵁ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ yanına gəlib dedim: "İslamda sabit qalacağıma dair sənə beyət edirəm." Peyğəmbər ﷺ: "Hər bir müsəlmana nəsihət etməlisən"– deyə qarşıma şərt qoydu. Mən buna da beyət etdim. (əl-Buxari, 58)

# ٣ – كِتَابُ العِلْمِ

# 3 – Elm kitabı

## ١– باب: فَضْلُ العِلْمِ

## 1-ci fəsil. Elmin fəziləti

٥٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: بَيْنَمَا النَّبِيُّ ﷺ فِي مَجْلِسٍ يُحَدِّثُ الْقَوْمَ جَاءَهُ أَعْرَابِيٌّ فَقَالَ مَتَى السَّاعَةُ فَمَضَى رَسُولُ اللَّهِ ﷺ يُحَدِّثُ فَقَالَ بَعْضُ الْقَوْمِ سَمِعَ مَا قَالَ فَكَرِهَ مَا قَالَ وَقَالَ بَعْضُهُمْ بَلْ لَمْ يَسْمَعْ حَتَّى إِذَا قَضَى حَدِيثَهُ قَالَ أَيْنَ أُرَاهُ السَّائِلُ عَنْ السَّاعَةِ قَالَ هَا أَنَا يَا رَسُولَ اللَّهِ قَالَ فَإِذَا ضُيِّعَتْ الأَمَانَةُ فَانْتَظِرْ السَّاعَةَ قَالَ كَيْفَ إِضَاعَتُهَا قَالَ إِذَا وُسِّدَ الأَمْرُ إِلَى غَيْرِ أَهْلِهِ فَانْتَظِرْ السَّاعَةَ [رواه البخاري: ٥٩]

**54.** Əbu Hureyra ﷺ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ camaatla söhbət edərkən bir bədəvi gəlib: "Qiyamət nə zaman qopacaq?" deyə soruşdu." Peyğəmbər ﷺ isə söhbətinə davam etdi. Oradakılardan kimisi: "O, (bu bədəvinin) sözünü eşitdi, lakin bu onun xoşuna gəlmədi"– dedi, kimisi də: "Xeyr, o eşitmədi"– dedi. Nəhayət, o, söhbətini bitirdikdən sonra: "Qiyamət barədə soruşan adam haradadır?"– deyə soruşdu. (Bədəvi): "Mən buradayam, ya Rəsulullah!"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Əmanət itiriləcəyi zaman Qiyaməti gözlə." (Bədəvi): "Əmanət necə itiriləcək?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "İşi, ona layiq olmayan adama tapşırdıqda Qiyaməti gözlə." (əl-Buxari, 59)

## ٢– باب: مَنْ رَفَعَ صَوْتَهُ بِالْعِلْمِ

## 2-ci fəsil. Elmi çatdırmaq məqsədilə səsini qaldıran adam

٥٥ – عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو رضي الله عنهما قَالَ: تَخَلَّفَ عَنَّا النَّبِيُّ ﷺ فِي سَفْرَةٍ سَافَرْنَاهَا فَأَدْرَكَنَا وَقَدْ أَرْهَقَتْنَا الصَّلاَةُ وَنَحْنُ نَتَوَضَّأُ فَجَعَلْنَا نَمْسَحُ عَلَى أَرْجُلِنَا فَنَادَى بِأَعْلَى صَوْتِهِ وَيْلٌ لِلأَعْقَابِ مِنْ النَّارِ مَرَّتَيْنِ أَوْ ثَلاَثًا. [رواه البخاري: ٦٠]

**55.** Abdullah ibn Amr رضي الله عنهما rəvayət edir ki, səfərdə olduğumuz zaman Peyğəmbər ﷺ bizdən geri qaldı, sonra da namazın vaxtının çıxmağına az qalmış gəlib bizə çatdı. (Namazın vaxtı çıxacaqdı deyə,) biz dəstəmaz alıb ayaqlarımıza məsh etməyə başladıq. Peyğəmbər ﷺ (bunu görcək) uca səslə iki və ya üç dəfə belə buyurdu: "Atəşə girən topuqların vay halına!" (əl-Buxari, 60)

## ٣– باب: طَرْحُ الإِمَامِ الْمَسْأَلَةَ عَلَى أَصْحَابِهِ لِيَخْتَبِرَ مَا عِنْدَهُمْ مِنَ الْعِلْمِ

## 3-cü fəsil. İmamın öz havadarlarına onların biliyini yoxlamaq məqsədilə sual verməsi

٥٦ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: إِنَّ مِنْ الشَّجَرِ شَجَرَةً لاَ يَسْقُطُ وَرَقُهَا وَإِنَّهَا مَثَلُ الْمُسْلِمِ حَدِّثُونِي مَا هِيَ قَالَ فَوَقَعَ النَّاسُ فِي شَجَرِ الْبَوَادِي قَالَ عَبْدُ اللَّهِ فَوَقَعَ فِي نَفْسِي أَنَّهَا النَّخْلَةُ فَاسْتَحْيَيْتُ ثُمَّ قَالُوا حَدِّثْنَا مَا هِيَ يَا رَسُولَ اللَّهِ قَالَ: هِيَ النَّخْلَةُ. [رواه البخاري: ٦١]

**56.** İbn Ömər ﷺ rəvayət edir ki, bir gün Peyğəmbər ﷺ dedi: “Ağaclar içərisində elə bir ağac vardır ki, onun yarpağı tökülmür və o, müsəlmana bənzəyir. Deyin görüm, o nədir?” Camaat vadilərdə bitən ağacları sadalamağa başladı.

İbn Ömər ﷺ dedi: “Mən onun xurma ağacı olduğunu düşündüm, lakin (bunu deməyə) utandım. Sonra camaat: “Söylə görək, o nədir, ya Rəsulullah?”– deyə soruşdular. Peyğəmbər ﷺ: “Bu, xurma ağacıdır”– dedi.” (əl-Buxari, 61)

## 4-cü fəsil. Hədis aliminin hüzurunda oxumaq və ya (hədisi) ona ərz etmək

## ٤– باب: القِرَاءَةُ و العَرْضُ عَلَى المُحَدِّث

٥٧ – عَنْ أَنَسِ بْنَ مَالك ﷺ قَالَ: بَيْنَمَا نَحْنُ جُلُوسٌ مَعَ النَّبِيِّ ﷺ فِي الْمَسْجد دَخَلَ رَجُلٌ عَلَى جَمَلٍ فَأَنَاخَهُ فِي الْمَسْجد ثُمَّ عَقَلَهُ ثُمَّ قَالَ لَهُمْ أَيُّكُمْ مُحَمَّدٌ وَالنَّبِيُّ ﷺ مُتَّكِئٌ بَيْنَ ظَهْرَانَيْهِمْ فَقُلْنَا هَذَا الرَّجُلُ الأَبْيَضُ الْمُتَّكِئُ فَقَالَ لَهُ الرَّجُلُ يَا ابْنَ عَبْد الْمُطَّلب فَقَالَ لَهُ النَّبِيُّ ﷺ قَدْ أَجَبْتُكَ فَقَالَ الرَّجُلُ لِلنَّبِيِّ ﷺ إِنِّي سَائِلُكَ فَمُشَدِّدٌ عَلَيْكَ فِي الْمَسْأَلَة فَلاَ تَجدْ عَلَيَّ فِي نَفْسكَ فَقَالَ سَلْ عَمَّا بَدَا لَكَ فَقَالَ أَسْأَلُكَ بِرَبِّكَ وَرَبِّ مَنْ قَبْلَكَ أَاللَّهُ أَرْسَلَكَ إِلَى النَّاسِ كُلِّهِمْ فَقَالَ اللَّهُمَّ نَعَمْ قَالَ أَنْشُدُكَ بِاللَّه أَاللَّهُ أَمَرَكَ أَنْ نُصَلِّيَ الصَّلَوَات الْخَمْسَ فِي الْيَوْمِ وَاللَّيْلَة قَالَ اللَّهُمَّ نَعَمْ قَالَ أَنْشُدُكَ بِاللَّه أَاللَّهُ أَمَرَكَ أَنْ نَصُومَ هَذَا الشَّهْرَ مِنْ السَّنَة قَالَ اللَّهُمَّ نَعَمْ قَالَ أَنْشُدُكَ بِاللَّه أَاللَّهُ أَمَرَكَ أَنْ تَأْخُذَ هَذه الصَّدَقَةَ مِنْ أَغْنِيَائِنَا فَتَقْسِمَهَا عَلَى فُقَرَائِنَا فَقَالَ النَّبِيُّ ﷺ اللَّهُمَّ نَعَمْ فَقَالَ الرَّجُلُ آمَنْتُ بِمَا جِئْتَ بِهِ وَأَنَا رَسُولُ مَنْ وَرَائِي مِنْ قَوْمِي وَأَنَا ضِمَامُ بْنُ ثَعْلَبَةَ أَخُو بَنِي سَعْدِ بْنِ بَكْرٍ. [رواه البخاري: ٦٣]

**57.** Ənəs ﷺ rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birgə məsciddə oturduğumuz zaman bir kişi dəvənin üstündə oraya yaxınlaşdı. Kişi dəvəni məsciddə dizi üstə çökdürdükdən sonra onu buxovladı, sonra da: “Hansınız Muhəmməddir?”– deyə soruşdu. Bu vaxt Peyğəmbər ﷺ əshabələrin arasında söykənib oturmuşdu. Biz: “(Axtardığın adam) söykənib oturan bu ağbəniz kişidir”– dedik. (Kişi): “Ey Abdul-Muttəlibin oğlu!”– deyə müraciət etdi. Peyğəmbər ﷺ: “Səni eşidirəm”– deyə buyurdu. (Kişi) dedi: “Mən səndən (bəzi şeylər) soruşacağam və sənə çox çətin suallar verəcəyəm. Odur ki, mənə acığın tutmasın.” Peyğəmbər ﷺ ona: “Ağlına gələni soruş”– deyə buyurdu. (Kişi) dedi: “Səni and verirəm sənin və səndən əvvəlkilərin Rəbbinə, (de görüm) səni bütün insanlara Allahmı (elçi) göndərdi?” (Peyğəmbər ﷺ): “Allah (şahiddir ki,) belədir!”– deyə buyurdu. (Kişi) dedi: “Səni and verirəm Allaha, (de görüm) gecə və gündüz beş vaxt namaz qılmağımızı sənə Allahmı əmr etdi?” (Peyğəmbər ﷺ): “Allah (şahiddir ki,) belədir!”– deyə buyurdu. (Kişi) dedi: “Səni and verirəm Allaha, (de görüm) ilin bu (bəlli) ayında oruc tutmağımızı sənə Allahmı əmr etdi?” (Peyğəmbər ﷺ): “Allah (şahiddir ki,) belədir!”– deyə buyurdu. (Kişi) dedi: “Səni and verirəm Allaha, (de görüm) varlılarımızdan sədəqə alıb kasıblarımıza paylaşdırmağı sənə Allahmı əmr etdi?” (Peyğəmbər ﷺ): “Allah (şahiddir ki,) belədir!”– deyə buyurdu. (Kişi) dedi: “Mən sənin gətirdiyinə iman gətirdim, mən qövmümün sənin yanına göndərdiyi elçisiyəm, mən Sə'd ibn Bəkr oğullarının qardaşı – Dimam ibn Sələbəyəm.” (əl-Buxari, 63)

٥٨ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما: أَنَّ رَسُولَ اللَّهِ ﷺ بَعَثَ بِكِتَابِهِ رَجُلاً وَأَمَرَهُ أَنْ يَدْفَعَهُ إِلَى عَظِيمِ الْبَحْرَيْنِ فَدَفَعَهُ عَظِيمُ الْبَحْرَيْنِ إِلَى كِسْرَى فَلَمَّا قَرَأَهُ مَزَّقَهُ. فَحَسِبْتُ أَنَّ ابْنَ الْمُسَيَّبِ قَالَ: فَدَعَا عَلَيْهِمْ رَسُولُ اللَّهِ ﷺ أَنْ يُمَزَّقُوا كُلَّ مُمَزَّقٍ. [رواه البخاري: ٦٤]

**58.** İbn Abbas ﵄ rəvayət edir ki, Allahın elçisi ﷺ bir kişiyə məktub verib onu Bəhreynin hökmdarına çatdırmağı əmr etdi. Bəhreynin hökmdarı da onu Xosrova təslim etdi. (Xosrov) məktubu oxuduqdan sonra onu cırıq-cırıq etdi.

(Hədisin ravilərindən olan İbn Şihab) deyir ki, zənnimcə Səid ibn əl-Museyyib demişdir: "Allahın elçisi ﷺ onlara: "Cırıq-cırıq olsunlar"– deyə bəddua etdi." (əl-Buxari, 64)

٥٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: كَتَبَ النَّبِيُّ ﷺ كِتَابًا أَوْ أَرَادَ أَنْ يَكْتُبَ فَقِيلَ لَهُ إِنَّهُمْ لاَ يَقْرَءُونَ كِتَابًا إِلاَّ مَخْتُومًا فَاتَّخَذَ خَاتَمًا مِنْ فِضَّةٍ نَقْشُهُ مُحَمَّدٌ رَسُولُ اللَّهِ كَأَنِّي أَنْظُرُ إِلَى بَيَاضِهِ فِي يَدِهِ. [رواه البخاري: ٦٥]

**59.** Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ məktub yazdırdı və ya yazdırmaq istədi. Ona: "O (hökmdarlar) möhürsüz məktubları oxumurlar"– deyildi. Buna görə də o, üstündə: "Muhəmməd Rəsulullah" sözü həkk edilmiş gümüş üzük düzəltdirdi. Bu üzüyün Peyğəmbərin ﷺ əlində iz qoymuş bəyazlığı hələ də gözlərim önündədir. (əl-Buxari, 65)

٦٠ – عَنْ أَبِي وَاقِدٍ اللَّيْثِيِّ رضي الله عنه، أَنَّ رَسُولَ اللَّهِ ﷺ بَيْنَمَا هُوَ جَالِسٌ فِي الْمَسْجِدِ وَالنَّاسُ مَعَهُ، إِذْ أَقْبَلَ ثَلاَثَةُ نَفَرٍ، فَأَقْبَلَ اثْنَانِ إِلَى رَسُولِ اللَّهِ ﷺ وَذَهَبَ وَاحِدٌ، قَالَ فَوَقَفَا عَلَى رَسُولِ اللَّهِ ﷺ فَأَمَّا أَحَدُهُمَا فَرَأَى فُرْجَةً فِي الْحَلْقَةِ فَجَلَسَ فِيهَا، وَأَمَّا الآخَرُ فَجَلَسَ خَلْفَهُمْ، وَأَمَّا الثَّالِثُ فَأَدْبَرَ ذَاهِبًا، فَلَمَّا فَرَغَ رَسُولُ اللَّهِ ﷺ قَالَ: «أَلاَ أُخْبِرُكُمْ عَنِ النَّفَرِ الثَّلاَثَةِ أَمَّا أَحَدُهُمْ فَأَوَى إِلَى اللَّهِ، فَآوَاهُ اللَّهُ، وَأَمَّا الآخَرُ فَاسْتَحْيَا، فَاسْتَحْيَا اللَّهُ مِنْهُ، وَأَمَّا الآخَرُ فَأَعْرَضَ، فَأَعْرَضَ اللَّهُ عَنْهُ». [رواه البخاري: ٦٦]

**60.** Əbu Vaqid əl-Leysi ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ camaatla birlikdə məsciddə oturarkən, (oraya) üç nəfər gəldi. İkisi Peyğəmbərə ﷺ tərəf yönəldi, biri isə çıxıb getdi. O iki nəfər Peyğəmbərin ﷺ yanında dayandı. Onlardan birisi dövrə vurub oturmuş camaatın arasında boş yer görüb orada əyləşdi. O birisi də onların arxa tərəfində əyləşdi. Üçüncüsü isə üz çevirib getdi. Peyğəmbər ﷺ söhbətini bitirdikdən sonra dedi: "Bu üç nəfər barədə sizə xəbər verimmi? Onlardan biri Allaha sığındı, Allah da ona sığınacaq verdi. Digəri utandı, Allah da ondan utandı. Üçüncüsünə gəldikdə isə, o, üz döndərdi, Allah da ondan üz döndərdi." (əl-Buxari, 66)

## ٥– باب: قَوْلُ النَّبِيِّ ﷺ: ﴿ رُبَّ مُبَلَّغٍ أَوْعَى مِنْ سَامِعٍ ﴾

## 5-ci fəsil. Peyğəmbərin ﷺ: «Bəzən, özünə (hədis) rəvayət edilmiş kəs, (bilavasitə) eşidən kəsdən yaxşı qavrayır»– sözü

٦١ – عَنْ أَبِي بَكْرَةَ رضي الله عنه، ذَكَرَ النَّبِيَّ ﷺ قَعَدَ عَلَى بَعِيرِهِ ، وَأَمْسَكَ إِنْسَانٌ بِخِطَامِهِ – أَوْ بِزِمَامِهِ – قَالَ: «أَيُّ يَوْمٍ هَذَا؟» فَسَكَتْنَا حَتَّى ظَنَنَّا أَنَّهُ سَيُسَمِّيهِ سِوَى اسْمِهِ. قَالَ: «أَلَيْسَ يَوْمَ النَّحْرِ؟» قُلْنَا بَلَى. قَالَ: «فَأَيُّ شَهْرٍ

هَذَا؟» فَسَكَتْنَا حَتَّى ظَنَنَّا أَنَّهُ سَيُسَمِّيهِ بِغَيْرِ اسْمِهِ. فَقَالَ: «أَلَيْسَ بِذِى الْحِجَّةِ؟» قُلْنَا بَلَى. قَالَ: «فَإِنَّ دِمَاءَكُمْ وَأَمْوَالَكُمْ وَأَعْرَاضَكُمْ بَيْنَكُمْ حَرَامٌ كَحُرْمَةِ يَوْمِكُمْ هَذَا، فِى شَهْرِكُمْ هَذَا، فِى بَلَدِكُمْ هَذَا. لِيُبَلِّغِ الشَّاهِدُ الْغَائِبَ، فَإِنَّ الشَّاهِدَ عَسَى أَنْ يُبَلِّغَ مَنْ هُوَ أَوْعَى لَهُ مِنْهُ». [رواه البخاري: ٦٧]

**61.** Əbu Bəkrə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ (vida həccində) dəvəsinə mindi. Bir nəfər dəvənin ovsarından (yaxud noxtasından tutmuşdu). Peyğəmbər ﷺ: “Bu, hansı gündür?”– deyə soruşdu. Biz susduq, hətta onun başqa bir ad deyəcəyini zənn etdik. O dedi: “Məgər (bu gün) qurban günü deyilmi?” Biz: “Bəli!”– deyə cavab verdik. Peyğəmbər ﷺ: “Bu, hansı aydır?”– deyə soruşdu. Biz susduq, hətta, onun başqa bir ad deyəcəyini güman etdik. O dedi: “Məgər (bu ay) zülhiccə ayı deyilmi?” Biz: “Bəli!”– deyə cavab verdik. O buyurdu: “Sizin qanınız, malınız və namusunuz, bu ayınız da və bu şəhəriniz də, bu gününüzün haramlığı kimi bir-birinizə haramdır. Qoy burada olanlar (eşitdiklərini) aramızda olmayanlara təbliğ etsinlər. Ola bilsin ki, burada olan kəs (bunu) daha yaxşı qavrayan bir kimsəyə çatdırsın.” (əl-Buxari, 67)

## ٦– باب: مَا كَانَ النَّبِيُّ ﷺ يَتَخَوَّلُهُمْ بِالْمَوْعِظَةِ و العِلْمِ كَيْ لاَ يَنْفِرُوا

## 6-cı fəsil. Peyğəmbər ﷺ (əshabələri) qaçmasınlar deyə, onlara yalnız münasib gördükdə öyüd-nəsihət edər və elm öyrədərdi

٦٢ – عَنْ ابْنِ مَسْعُودٍ ﵁ قَالَ: كَانَ النَّبِىُّ ﷺ يَتَخَوَّلُنَا بِالْمَوْعِظَةِ فِى الأَيَّامِ، كَرَاهَةَ السَّآمَةِ عَلَيْنَا. [رواه البخاري: ٦٨]

**62.** İbn Məsud ﵁ rəvayət edir ki, (söylədikləri) bizi üzməsin deyə, Peyğəmbər ﷺ bizə (yalnız münasib) günlərdə öyüd-nəsihət edərdi. (əl-Buxari, 68)

٦٣ – عَنْ أَنَسٍ ﵁، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «يَسِّرُوا وَلاَ تُعَسِّرُوا، وَبَشِّرُوا وَلاَ تُنَفِّرُوا». [رواه البخاري: ٦٩]

**63.** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Asanlaşdırın, çətinləşdirməyin. Müjdələyin, nifrət oyatmayın.” (əl-Buxari, 69)

## ٧– باب: مَنْ يُرِدِ اللهُ بِهِ خَيْراً يُفَقِّهْهُ فِي الدِّينِ

## 7-ci fəsil. Allah kimə xeyir nəsib etmək istəsə, ona dini başa düşməyi müyəssər edər

٦٤ – عَنْ مُعَاوِيَةَ ﵁ قَالَ: سَمِعْتُ النَّبِىَّ ﷺ يَقُولُ: «مَنْ يُرِدِ اللَّهُ بِهِ خَيْرًا يُفَقِّهْهُ فِى الدِّينِ، وَإِنَّمَا أَنَا قَاسِمٌ وَاللَّهُ يُعْطِى، وَلَنْ تَزَالَ هَذِهِ الأُمَّةُ قَائِمَةً عَلَى أَمْرِ اللَّهِ لاَ يَضُرُّهُمْ مَنْ خَالَفَهُمْ حَتَّى يَأْتِىَ أَمْرُ اللَّهِ». [رواه البخاري: ٧١]

**64.** Müaviyə ﵁ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Allah kimə xeyir nəsib etmək istəsə, ona dini başa düşməyi müyəssər edər. Mən yalnız paylaşdırıram. Verən isə Allahdır. Bu ümmətin (bir qismi) Allahın əmri gələnə qədər (Qiyamət qopanadək) Allahın dini üzərində sabit qalacaq və belələrinə müxalif olanlar onlara heç bir zərər verə bilməyəcəklər.” (əl-Buxari, 71)

## 8-ci fəsil. Elmi dərindən bilmək

## ٨– باب: الفَهْمُ فِي العِلْمِ

٦٥ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: كُنَّا عِنْدَ النَّبِيِّ ﷺ فَأُتِيَ بِجُمَّارٍ فَقَالَ «إِنَّ مِنَ الشَّجَرِ شَجَرَةً مَثَلُهَا كَمَثَلِ الْمُسْلِمِ». فَأَرَدْتُ أَنْ أَقُولَ هِيَ النَّخْلَةُ، فَإِذَا أَنَا أَصْغَرُ الْقَوْمِ فَسَكَتُّ، قَالَ النَّبِيُّ ﷺ «هِيَ النَّخْلَةُ». [رواه البخاري: ٧٢]

**65.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, biz Peyğəmbərin ﷺ yanında ikən (oraya) xurma ağacının özəyi gətirildi və Peyğəmbər ﷺ: “Ağaclar içərisində elə bir ağac vardır ki, onun məsəli müsəlmanın məsəlinə bənzəyir”– dedi. Mən, o xurma ağacıdır demək istədim, lakin baxdım ki, orada oturanların ən kiçiyi mənəm və buna görə də susdum. Peyğəmbər ﷺ: “Bu, xurma ağacıdır”– dedi. (əl-Buxari, 72)

## 9-cu fəsil. Elm və hikmət (bəxş edilmiş kəsə) qibtə etmək

## ٩– باب: الاغْتِبَاطُ فِي العِلْمِ و الحِكْمَةِ

٦٦ – عَنْ عَبْدُ اللهِ بْنِ مَسْعُود رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ «لاَ حَسَدَ إِلاَّ فِي اثْنَتَيْنِ رَجُلٌ آتَاهُ اللَّهُ مَالاً فَسُلِّطَ عَلَى هَلَكَتِهِ فِي الْحَقِّ ، وَرَجُلٌ آتَاهُ اللَّهُ الْحِكْمَةَ، فَهْوَ يَقْضِي بِهَا وَيُعَلِّمُهَا». [رواه البخاري: ٧٣]

**66.** Abdullah ibn Məsud رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Yalnız iki nəfərə həsəd aparmaq olar: o adama ki, Allah ona var-dövlət vermiş, o da bu var-dövlətdən haqq yolda xərcləmişdir; bir də o adama ki, Allah ona hikmət bəxş etmiş, o da bununla hökm etmiş və bunu başqalarına öyrətmişdir.” (əl-Buxari, 73)

## 10-cu fəsil. Peyğəmbərin ﷺ: «Allahım, ona Kitabı öyrət»– sözü

## ١٠– باب: قَوْلُ النَّبِيِّ ﷺ: ﴿ اللَّهُمَّ عَلِّمْهُ الكِتَابَ ﴾

٦٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: ضَمَّنِي رَسُولُ اللَّهِ ﷺ وَقَالَ: «اللَّهُمَّ عَلِّمْهُ الْكِتَابَ». [رواه البخاري: ٧٥]

**67.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ məni bağrına basıb dedi: “Allahım, ona Kitabı[1] öyrət!” (əl-Buxari, 75)

## 11-ci fəsil. Uçağın neçə yaşından eşitdiyi (hədislər) məqbul sayıla bilər

## ١١– باب: مَتَى يَصِحُّ سِمَاعُ الصَّغِيرِ

٦٨ – عَنْهُ رضي الله عنهما قَالَ: أَقْبَلْتُ رَاكِبًا عَلَى حِمَارٍ أَتَانٍ، وَأَنَا يَوْمَئِذٍ قَدْ نَاهَزْتُ الاحْتِلاَمَ، وَرَسُولُ اللَّهِ ﷺ يُصَلِّي بِمِنًى إِلَى غَيْرِ جِدَارٍ، فَمَرَرْتُ بَيْنَ يَدَيْ بَعْضِ الصَّفِّ وَأَرْسَلْتُ الأَتَانَ تَرْتَعُ، فَدَخَلْتُ فِي الصَّفِّ، فَلَمْ يُنْكِرْ ذَلِكَ عَلَيَّ. [رواه البخاري: ٧٦]

[1] Yəni Quranı.

**68.** İbn Abbas ﷠ rəvayət edir ki, Peyğəmbər ﷺ Minada[1] (camaata) sütrəsiz[2] halda namaz qıldırarkən mən dişi eşşəyin üstündə oraya yaxınlaşdım. O vaxt mən artıq həddi-büluğa çatmışdım. Mən (eşşəyin üstündə) cərgələrdən birinin önündən keçdim, (sonra da) eşşəyi otlamağa buraxdım. Özüm isə cərgəyə daxil oldum. Bu (hərəkətimə) görə heç kəs mənə irad tutmadı. (əl-Buxari, 76)

٦٩ – عَنْ مَحْمُودِ بْنِ الرَبِيعِ ﷛ قَالَ عَقَلْتُ مِنَ النَّبِيِّ ﷺ مَجَّةً مَجَّهَا فِى وَجْهِى وَأَنَا ابْنُ خَمْسِ سِنِينَ مِنْ دَلْوٍ. [رواه البخاري: ٧٧]

**69.** Mahmud ibn Rabi ﷛ demişdir: "Beş yaşımda ikən Peyğəmbərin ﷺ su qabından (ağzına su alıb) üzümə püskürtdüyünü yadımda saxlamışam. (əl-Buxari, 77)

## ١٢– باب: فَضْلُ مَنْ عَلِمَ و عَلَّمَ

## 12-ci fəsil. Elm öyrənən və başqalarına öyrədən kimsənin fəziləti

٧٠ – عَنْ أَبِي مُوسَى ﷛، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَثَلُ مَا بَعَثَنِى اللَّهُ بِهِ مِنَ الْهُدَى وَالْعِلْمِ كَمَثَلِ الْغَيْثِ الْكَثِيرِ أَصَابَ أَرْضًا، فَكَانَ مِنْهَا نَقِيَّةٌ قَبِلَتِ الْمَاءَ، فَأَنْبَتَتِ الْكَلأَ وَالْعُشْبَ الْكَثِيرَ، وَكَانَتْ مِنْهَا أَجَادِبُ أَمْسَكَتِ الْمَاءَ، فَنَفَعَ اللَّهُ بِهَا النَّاسَ، فَشَرِبُوا وَسَقَوْا وَزَرَعُوا، وَأَصَابَتْ مِنْهَا طَائِفَةً أُخْرَى، إِنَّمَا هِىَ قِيعَانٌ لاَ تُمْسِكُ مَاءً، وَلاَ تُنْبِتُ كَلأً، فَذَلِكَ مَثَلُ مَنْ فَقِهَ فِى دِينِ اللَّهِ وَنَفَعَهُ مَا بَعَثَنِى اللَّهُ بِهِ، فَعَلِمَ وَعَلَّمَ ، وَمَثَلُ مَنْ لَمْ يَرْفَعْ بِذَلِكَ رَأْسًا، وَلَمْ يَقْبَلْ هُدَى اللَّهِ الَّذِى أُرْسِلْتُ بِهِ». [رواه البخاري:٧٩]

**70.** Əbu Musa ﷛ rəvayət edir ki, Peyğəmbər ﷺ belə demişdir: "Allahın mənim vasitəmlə göndərdiyi doğru yol göstəricisi və elm, torpağa düşən bol yağmura bənzəyir. Bu torpağın bir qismi münbit olduğundan, suyu canına çəkib *növbənöv* bitkilər və çoxlu otlar yetişdirir; bir qismi də quru olduğundan, suyu *üstündə* saxlayır və Allah da onunla insanları faydalandırır. Onlar bu sudan içir, üstəlik heyvanlarını və əkin sahələrini də sulayırlar; bu yağışın düşdüyü elə bir yer də vardır ki, ora hamar olduğundan, nə suyu (üstündə) saxlayır, nə də bir bitki yetişdirir. Bu, Allahın dinini dərk edən, Allahın mənim vasitəmlə göndərdiyindən faydalanan, elm öyrənən və (bunu başqalarına) öyrədən kimsə ilə, buna tərəf başını belə qaldırmayan və Allahın mənim vasitəmlə göndərdiyi doğru yol göstəricisini qəbul etməyən kimsənin məsəlidir." (əl-Buxari, 79)

## ١٣– باب: رَفْعُ العِلْمِ وَ ظُهُورِ الْجَهْلِ

## 13-cü fəsil. Elmin aradan qaldırılması və cahilliyin meydana çıxması

٧١ – عَنْ أَنَسٍ ﷛ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ «إِنَّ مِنْ أَشْرَاطِ السَّاعَةِ أَنْ يُرْفَعَ الْعِلْمُ، وَيَثْبُتَ الْجَهْلُ، وَيُشْرَبَ الْخَمْرُ، وَيَظْهَرَ الزِّنَا». [رواه البخاري: ٨٠]

---

[1] Mina – Məkkə yaxınlığındakı vadidir.

[2] Namaz qıldıqda qarşıya qoyulan, hündürlüyü də təqribən dirsək boyda olan ağac və ya ona bənzər əşya sütrə adlanır.

**71.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə demişdir: “Elmin aradan qaldırılması, cahilliyin kök atması, şərabın (çox) içilməsi və zinakarlığın yayılması Qiyamət Saatının əlamətlərindəndir.” (əl-Buxari, 80)

٧٢ – عَنْهُ ﷺ قَالَ: لأُحَدِّثَنَّكُمْ حَدِيثًا لاَ يُحَدِّثُكُمْ أَحَدٌ بَعْدِى سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ «مِنْ أَشْرَاطِ السَّاعَةِ أَنْ يَقِلَّ الْعِلْمُ، وَيَظْهَرَ الْجَهْلُ، وَيَظْهَرَ الزِّنَا، وَتَكْثُرَ النِّسَاءُ وَيَقِلَّ الرِّجَالُ، حَتَّى يَكُونَ لِخَمْسِينَ امْرَأَةً الْقَيِّمُ الْوَاحِدُ». [رواه البخاري: ٨١]

**72.** Ənəs ﷺ belə demişdir: “Sizə elə bir hədis danışacağam ki, məndən sonra heç bir kimsə onu sizə rəvayət etməyəcəkdir. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Elmin azalması, cahilliyin meydana çıxması, zinakarlığın yayılması və əlli qadına bir kişi düşəcək qədər qadınların çoxalıb kişilərin isə azalması Qiyamət Saatının əlamətlərindəndir.” (əl-Buxari, 81)

## 14-cü fəsil. Elmin fəziləti

## ١٤– باب: فَضْلُ العِلْمِ

٧٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ قَالَ «بَيْنَا أَنَا نَائِمٌ أُتِيتُ بِقَدَحِ لَبَنٍ، فَشَرِبْتُ حَتَّى إِنِّى لأَرَى الرِّيَّ يَخْرُجُ فِى أَظْفَارِى، ثُمَّ أَعْطَيْتُ فَضْلِى عُمَرَ بْنَ الْخَطَّابِ». قَالُوا فَمَا أَوَّلْتَهُ يَا رَسُولَ اللَّهِ قَالَ: «الْعِلْمَ». [رواه البخاري: ٨٢]

**73.** İbn Ömər ﷺ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Yuxuda (gördüm ki,) mənə bir cam süd gətirdilər. (Mən bu süddən) o qədər içdim ki, nəhayət, dırnaqlarımın ucundan tər axdığını gördüm (doyduğumu hiss etdim). Sonra artığımı Ömər ibn Xəttaba verdim.” Əshabələr: “Sən bu yuxunu necə yozdun, ya Rəsulullah?”– deyə soruşdular. O: “Elm!”– deyə cavab verdi. (əl-Buxari, 82)

## 15-ci fəsil. Heyvanın və ya başqa bir şeyin üzərində oturulu halda fitva vermək

## ١٥– باب: الْفُتْيَا وَ هُوَ وَاقِفٌ عَلَى الدَّابَّةِ وَ غَيْرِهَا

٧٤ – عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرِو بْنِ العَاصِ ﷺ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ وَقَفَ فِى حَجَّةِ الْوَدَاعِ بِمِنًى لِلنَّاسِ يَسْأَلُونَهُ، فَجَاءَهُ رَجُلٌ فَقَالَ لَمْ أَشْعُرْ فَحَلَقْتُ قَبْلَ أَنْ أَذْبَحَ. فَقَالَ: «اذْبَحْ وَلاَ حَرَجَ». فَجَاءَ آخَرُ فَقَالَ لَمْ أَشْعُرْ، فَنَحَرْتُ قَبْلَ أَنْ أَرْمِىَ. قَالَ: «ارْمِ وَلاَ حَرَجَ». فَمَا سُئِلَ النَّبِىُّ ﷺ عَنْ شَىْءٍ قُدِّمَ وَلاَ أُخِّرَ إِلاَّ قَالَ افْعَلْ وَلاَ حَرَجَ. [رواه البخاري: ٨٣]

**74.** Abdullah ibn Amr ibn As ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ vida həccində, ona sual verən insanlar olduğuna görə Mina vadisində dayandı. Bir nəfər onun yanına gəlib: “Bilmədim, qurban kəsməzdən əvvəl başımı qırxdırdım”– dedi. (Peyğəmbər ﷺ): “Eyib etməz, (get, indi) kəs!”– deyə buyurdu. Başqa birisi gəlib: “Bilmədim, (şeytana) daş atmazdan əvvəl qurban kəsdim”– dedi. (Peyğəmbər ﷺ): “Eybi yoxdur, (get, indi) at!”– deyə buyurdu. (Həmin gün) Peyğəmbərdən ﷺ (qurban kəsmək, baş qırxdırmaq, daş atmaq, təvaf etmək kimi həcc ayinlərindən) önə keçirilmiş və ya təxirə salınmış hansı bir şey haqqında soruşdularsa, o sadəcə: “Eybi yoxdur, (get, indi) elə”– deyə buyurdu.” (əl-Buxari, 83)

## 16-cı fəsil. Əl və ya baş ilə işarə etməklə suala cavab vermək

## ١٦– باب: مَنْ أَجَابَ الْفُتْيَا بِإِشَرَاةِ الرَّأْسِ و اليَدِ

٧٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «يُقْبَضُ الْعِلْمُ، وَيَظْهَرُ الْجَهْلُ وَ الْفِتَنُ، وَيَكْثُرُ الْهَرْجُ». قِيلَ يَا رَسُولَ اللَّهِ وَمَا الْهَرْجُ؟ فَقَالَ هَكَذَا بِيَدِهِ، فَحَرَّفَهَا، كَأَنَّهُ يُرِيدُ الْقَتْلَ. [رواه البخاري: ٨٥]

**75.** Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ: "(Qiyamətə yaxın) elm aradan qaldırılacaq, cəhalət və fitnələr üzə çıxacaq və hərc[1] çoxalacaq"– dedi. Ondan: "Hərc nədir, ya Rəsulullah?"– deyə soruşdular. O, əlini çəpəki vəziyyətdə yuxarıdan aşağı endirib: "Bax belə"– deyə buyurdu, sanki qətl törədiləcəyini qəsd edirdi. (əl-Buxari, 85)

٧٦ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ﷺ قَالَتْ أَتَيْتُ عَائِشَةَ وَهِيَ تُصَلِّى فَقُلْتُ مَا شَأْنُ النَّاسِ فَأَشَارَتْ إِلَى السَّمَاءِ، فَإِذَا النَّاسُ قِيَامٌ، فَقَالَتْ سُبْحَانَ اللَّه. قُلْتُ آيَةٌ فَأَشَارَتْ بِرَأْسِهَا، أَىْ نَعَمْ، فَقُمْتُ حَتَّى تَجَلاَّنِى الْغَشْىُ، فَجَعَلْتُ أَصُبُّ عَلَى رَأْسِى الْمَاءَ، فَحَمِدَ اللَّهَ عَزَّ وَجَلَّ النَّبِىُّ ﷺ وَأَثْنَى عَلَيْهِ، ثُمَّ قَالَ: «مَا مِنْ شَىْءٍ لَمْ أَكُنْ أُرِيتُهُ إِلاَّ رَأَيْتُهُ فِى مَقَامِى حَتَّى الْجَنَّةَ وَالنَّارَ، فَأُوحِىَ إِلَىَّ أَنَّكُمْ تُفْتَنُونَ فِى قُبُورِكُمْ، مِثْلَ – أَوْ قَرِيبًا لاَ أَدْرِى أَىَّ ذَلِكَ قَالَتْ أَسْمَاءُ – مِنْ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ، يُقَالُ مَا عِلْمُكَ بِهَذَا الرَّجُلِ فَأَمَّا الْمُؤْمِنُ – أَوِ الْمُوقِنُ لاَ أَدْرِى بِأَيِّهِمَا قَالَتْ أَسْمَاءُ – فَيَقُولُ هُوَ مُحَمَّدٌ رَسُولُ اللَّهِ جَاءَنَا بِالْبَيِّنَاتِ وَالْهُدَى، فَأَجَبْنَا وَاتَّبَعْنَا، هُوَ مُحَمَّدٌ. ثَلاَثًا، فَيُقَالُ نَمْ صَالِحًا ، قَدْ عَلِمْنَا إِنْ كُنْتَ لَمُوقِنًا بِهِ، وَأَمَّا الْمُنَافِقُ – أَوِ الْمُرْتَابُ لاَ أَدْرِى أَىَّ ذَلِكَ قَالَتْ أَسْمَاءُ – فَيَقُولُ لاَ أَدْرِى، سَمِعْتُ النَّاسَ يَقُولُونَ شَيْئًا فَقُلْتُهُ». [رواه البخاري: ٨٦]

**76.** Əsma bint Əbu Bəkr ﷺ rəvayət edir ki, (günəş tutulduğu vaxt) mən Aişənin yanına gəldim, (o vaxt) o namaz qılırdı. Mən: "İnsanlara nə olub?"– deyə soruşdum. O, (günəşin tutulduğunu bildirmək üçün əli ilə) göyə işarə etdi. (Mən məscidə tərəf boylanıb gördüm ki,) camaat namaz qılır. (Aişə): "Allah pak və müqəddəsdir!"– dedi. Mən: "(Bu,) əlamətdirmi?"– deyə soruşdum. O, başı ilə işarə edib (mənim sözümü) təsdiqlədi. Bu səbəbdən mən də namaza durdum. Nəhayət, halsızlaşıb əldən düşdüm və başıma su tökməyə başladım. (Namazdan sonra) Peyğəmbər ﷺ qüdrətli və əzəmətli Allaha həmd edib Onun şəninə təriflər dedi, sonra da belə buyurdu: "Bu yerdə mən, əvvəllər mənə göstərilmiş hər bir şeyi, hətta, Cənnət və Cəhənnəmi gördüm. Mənə vəhy olundu ki, siz qəbirlərinizdə məsihi-dəccalın imtahanına bənzər (və ya buna yaxın[2]) bir imtahana çəkiləcəksiniz. (Dünyasını dəyişmiş kimsədən): "Bu adam[3] haqqında nə bilirsən?"– deyə soruşacaqlar. Mömin (yaxud yəqinliklə inanan[4]) bəndə: "Bu, Allahın elçisi Muhəmmədir. O, bizə dəlillər və doğru yol göstəricisi gətirdi. Biz də (onun dəvətini) qəbul edib (onun) ardınca getdik. Bu, Muhəmməddir!"– deyəcək. O bunu üç dəfə təkrar edəcək. Bundan sonra (mələklər) ona: "Rahat yat! Biz artıq sənin ona qətiyyətlə iman gətirdiyini bildik"– deyəcəklər. Müna-

[1] "Hərc" sözünün hərfi tərcüməsi, əmin-amanlıq və qayda-qanunun olmadığı vəziyyət, qarışıqlıq, nizamsızlıq, çaxnaşma, araqarışma, vəlvələ, mərəkə, hərc-mərclik deməkdir.
[2] Bu, hədisi rəvayət edən ravilərdən birinin şəkkidir.
[3] Burada "bu adam" deyildikdə, Muhəmməd Peyğəmbər ﷺ qəsd edilir.
[4] Bu, hədisi rəvayət edən ravilərdən birinin şəkkidir.

fiq (və ya qəlbində şübhə olan) adam isə: "Bilmirəm, mən sadəcə insanların bəzi şeylər danışdıqlarını eşidir və həmin şeyi mən də deyirdim"– deyəcək. (əl-Buxari, 86)

## 17-ci fəsil. Ortaya çıxmış bir məsələnin həllini tapmaq məqsədilə səfərə çıxmaq və ailəyə də öyrətmək

## ١٧– باب: الرِّحْلَةُ فِي الْمَسْأَلَةِ النَّازِلَةِ، وِ تَعْلِيمِ أَهْلِهِ

٧٧ – عَنْ عَبْدُ اللَّهِ بْنُ أَبِى مُلَيْكَةَ عَنْ عُقْبَةَ بْنِ الحَارِثِ ﷺ أَنَّهُ تَزَوَّجَ ابْنَةً لأَبِى إِهَابِ بْنِ عَزِيزٍ، فَأَتَتْهُ امْرَأَةٌ فَقَالَتْ إِنِّى قَدْ أَرْضَعْتُ عُقْبَةَ وَالَّتِى تَزَوَّجَ بِهَا. فَقَالَ لَهَا عُقْبَةُ مَا أَعْلَمُ أَنَّكِ أَرْضَعْتِنِى وَلاَ أَخْبَرْتِنِى. فَرَكِبَ إِلَى رَسُولِ اللَّهِ ﷺ بِالْمَدِينَةِ فَسَأَلَهُ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ «كَيْفَ وَقَدْ قِيلَ». فَفَارَقَهَا عُقْبَةُ، وَنَكَحَتْ زَوْجًا غَيْرَهُ. [رواه البخاري: ٨٨]

**77.** Abdullah ibn Əbu Müleykə ﷺ rəvayət edir ki, Uqbə ibn əl-Haris ﷺ Əbu İhab ibn Əzizin qızı ilə evləndikdən sonra onun yanına bir qadın gəlib: "Uqbəni də, onun evləndiyi qadını da mən əmizdirmişəm"– dedi. Uqbə ﷺ ona: "Məni əmizdirdiyindən xəbərim yoxdur və sən (heç vaxt bunu) mənə bildirməmisən"– dedikdən sonra heyvanına minib Mədinəyə – Peyğəmbərin ﷺ yanına getdi və (bu məsələni) ondan soruşdu. Peyğəmbər ﷺ dedi: "(Əbu İhabın qızı sənin süd bacındır) deyildiyi halda, o, necə (sənin arvadın) ola bilər?" Beləliklə, Uqbə ﷺ onu boşadı və o, başqasına ərə getdi. (əl-Buxari, 88)

## 18-ci fəsil. Növbə ilə elm öyrənmək

## ١٨– باب: التَّنَاوُبُ فِي العِلْمِ

٧٨ – عَنْ عُمَرَ قَالَ كُنْتُ أَنَا وَجَارٌ لِى مِنَ الأَنْصَارِ فِى بَنِى أُمَيَّةَ بْنِ زَيْدٍ، وَهْىَ مِنْ عَوَالِى الْمَدِينَةِ، وَكُنَّا نَتَنَاوَبُ النُّزُولَ عَلَى رَسُولِ اللَّهِ ﷺ يَنْزِلُ يَوْمًا وَأَنْزِلُ يَوْمًا، فَإِذَا نَزَلْتُ جِئْتُهُ بِخَبَرِ ذَلِكَ الْيَوْمِ مِنَ الْوَحْىِ وَغَيْرِهِ، وَإِذَا نَزَلَ فَعَلَ مِثْلَ ذَلِكَ، فَنَزَلَ صَاحِبِى الأَنْصَارِىُّ يَوْمَ نَوْبَتِهِ، فَضَرَبَ بَابِى ضَرْبًا شَدِيدًا. فَقَالَ أَثَمَّ هُوَ فَفَزِعْتُ فَخَرَجْتُ إِلَيْهِ فَقَالَ قَدْ حَدَثَ أَمْرٌ عَظِيمٌ. قَالَ فَدَخَلْتُ عَلَى حَفْصَةَ فَإِذَا هِىَ تَبْكِى فَقُلْتُ طَلَّقَكُنَّ رَسُولُ اللَّهِ ﷺ قَالَتْ لاَ أَدْرِى. ثُمَّ دَخَلْتُ عَلَى النَّبِىِّ ﷺ فَقُلْتُ وَأَنَا قَائِمٌ أَطَلَّقْتَ نِسَاءَكَ قَالَ: «لاَ». فَقُلْتُ اللَّهُ أَكْبَرُ. [رواه البخاري: ٨٩]

**78.** Ömər ﷺ rəvayət edir ki, "Mən və ənsardan olan bir qonşum Bəni Ümeyyə ibn Zeyd tayfasında – Mədinənin yaxınlığında yerləşən bir kənddə qalırdıq. Biz növbə ilə Peyğəmbərin ﷺ yanına gedərdik. Bir gün o gedir, bir gün də mən gedirdim. Mən Peyğəmbərin ﷺ yanına getdikdə həmin gün nazil olan vəhyləri və digər xəbərləri (qonşuma) çatdırar, həmçinin o da belə edərdi. Bir gün ənsarlı yoldaşım öz növbəsində Rəsulallahın ﷺ yanına getdi və geri döndükdə qapımı bərk-bərk döyüb: "O, buradadırmı[1]?"– deyə soruşdu. Mən həyəcanlandım və dərhal onun yanına çıxdım. O: "Dəhşətli bir hadisə baş verib!"– dedi.

[1] Yəni, Ömər ﷺ evdədirmi.

Mən Həfsənin yanına daxil olub onun ağladığını gördükdə (ondan): "Allahın elçisi ﷺ sizi boşayıbmı?"– deyə soruşdum. (Həfsə): "Bilmirəm"– dedi. Sonra mən Peyğəmbərin ﷺ yanına girdim və ayaq üstə dayanıb: "Zövcələrini boşadınmı?"– deyə soruşdum. O: "Xeyr!"– deyə cavab verdi. Mən də: "Allah Böyükdür!"– dedim. (əl-Buxari, 89)

## ١٩– باب: الْغَضَبُ فِي الْمَوْعِظَةِ و التَعْلِيمِ إِذَا رَأَي مَا يَكْرَهُ

## 19-cu fəsil. Öyüd-nəsihət verdikdə və elm öyrətdikdə xoşagəlməz bir şey görüb qəzəblənmək

٧٩ – عَنْ أَبِي مَسْعُودٍ الأَنْصَرِي ﷺ قَالَ: قَالَ رَجُلٌ يَا رَسُولَ اللَّه، لاَ أَكَادُ أُدْرِكُ الصَّلاَةَ مِمَّا يُطَوِّلُ بِنَا فُلاَنٌ، فَمَا رَأَيْتُ النَّبِيَّ ﷺ فِى مَوْعِظَةٍ أَشَدَّ غَضَبًا مِنْ يَوْمِئِذٍ فَقَالَ: «أَيُّهَا النَّاسُ، إِنَّكُمْ مُنَفِّرُونَ، فَمَنْ صَلَّى بِالنَّاسِ فَلْيُخَفِّفْ، فَإِنَّ فِيهِمُ الْمَرِيضَ وَالضَّعِيفَ وَذَا الْحَاجَةِ». [رواه البخاري: ٩٠]

**79.** Əbu Məsud əl-Ənsari ﷺ rəvayət edir ki, bir nəfər: "Ya Rəsulallah! Filankəs bizə qıldırdığı namazı uzatdığına görə mən çox vaxt namaza vaxtında gəlmirəm"– dedi. (Əbu Məsud ﷺ) dedi: "Mən Peyğəmbərin ﷺ moizə əsnasında, o günkü qədər bərk qəzəbləndiyini görməmişdim. Elə buna görə də o, belə buyurdu: "Ey insanlar! Siz, həqiqətən də, nifrət oyadanlarsınız. Qoy camaata namaza qıldıran kəs (bunu) xəfif etsin. Çünki onların arasında xəstələr, zəiflər və (təcili) işi çıxmış kimsələr ola bilər." (əl-Buxari, 90)

٨٠ – عَنْ زَيْدِ بْنِ خَالِدٍ الْجُهَنِيِّ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ سَأَلَهُ رَجُلٌ عَنِ اللُّقَطَةِ فَقَالَ: «اعْرِفْ وِكَاءَهَا – أَوْ قَالَ وِعَاءَهَا – وَعِفَاصَهَا، ثُمَّ عَرِّفْهَا سَنَةً، ثُمَّ اسْتَمْتِعْ بِهَا، فَإِنْ جَاءَ رَبُّهَا فَأَدِّهَا إِلَيْهِ». قَالَ فَضَالَّةُ الإِبِلِ؟ فَغَضِبَ حَتَّى احْمَرَّتْ وَجْنَتَاهُ – أَوْ قَالَ احْمَرَّ وَجْهُهُ – فَقَالَ: «وَمَا لَكَ وَلَهَا مَعَهَا سِقَاؤُهَا وَحِذَاؤُهَا، تَرِدُ الْمَاءَ، وَتَرْعَى الشَّجَرَ، فَذَرْهَا حَتَّى يَلْقَاهَا رَبُّهَا». قَالَ فَضَالَّةُ الْغَنَمِ قَالَ: «لَكَ أَوْ لأَخِيكَ أَوْ لِلذِّئْبِ». [رواه البخاري: ٩١]

**80.** Zeyd ibn Xalid əl-Cühəni ﷺ rəvayət edir ki, bir adam Peyğəmbərdən ﷺ tapılmış əşya barəsində soruşdu. Peyğəmbər ﷺ dedi: "(Əvvəlcə) o əşyaya bağlanılmış ipin və (yaxud əşyanın saxlanıldığı) qabın (kimə məxsus olduğunu) öyrənməli, sonra da bir il ərzində bu tapılmış əşya barədə (insanlara) bildirməlisən. Bundan sonra sən ondan istifadə edə bilərsən. Hərgah o əşyanın sahibi gəlib çıxarsa, onda onu sahibinə qaytarmalısan." Adam: "Bəs itmiş dəvə necə?"– deyə soruşdu. Peyğəmbər ﷺ o qədər qəzəbləndi ki, yanaqları (və ya üzü) qızardı. Dedi: "Ondan sənə nə? Onun tuluğu və pəncəsi yanında ikən bulaq başına gəlir, ağaclardan yarpaq yeyir. Elə isə sahibi onu tapıncaya qədər ona toxunma!" Adam: "Bəs itmiş qoyun necə?"– deyə soruşdu. Peyğəmbər ﷺ dedi: "O ya sənə, ya sənin qardaşına, ya da canavara çatacaq." (əl-Buxari, 91)

٨١ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: سُئِلَ النَّبِيُّ ﷺ عَنْ أَشْيَاءَ كَرِهَهَا، فَلَمَّا أُكْثِرَ عَلَيْهِ غَضِبَ، ثُمَّ قَالَ لِلنَّاسِ «سَلُونِى عَمَّا شِئْتُمْ». قَالَ رَجُلٌ مَنْ أَبِى قَالَ: «أَبُوكَ حُذَافَةُ». فَقَامَ آخَرُ فَقَالَ مَنْ أَبِى يَا رَسُولَ اللَّهِ، فَقَالَ: «أَبُوكَ سَالِمٌ مَوْلَى شَيْبَةَ». فَلَمَّا رَأَى عُمَرُ مَا فِى وَجْهِهِ قَالَ يَا رَسُولَ اللَّهِ، إِنَّا نَتُوبُ إِلَى اللَّهِ عَزَّ وَجَلَّ. [رواه البخاري: ٩٢]

**81.** Əbu Musa ﷺ rəvayət edir ki, (insanlar) Peyğəmbərdən ﷺ onun xoşuna gəlmədiyi bəzi şeylər barəsində soruşdular. (Peyğəmbərə ﷺ) verilən suallar çoxaldıqda o qəzəbləndi və camaata: "Nə haqda (soruşmaq) istəyirsinizsə, soruşun?"– dedi. Birisi: "Mənim atam kimdir?"– deyə soruşdu. (Peyğəmbər ﷺ): "Atan Hüzafədir"– dedi. Başqa birisi ayağa qalxıb: "Mənim atam kimdir?"– deyə soruşdu. (Peyğəmbər ﷺ): "Atan Şeybənin (köləlikdən) azad etdiyi Salimdir"– dedi. Ömər (Peyğəmbərin ﷺ) üzündəki qəzəbi gördükdə dedi: "Ya Rəsulullah! Həqiqətən, biz qüdrətli və əzəmətli Allaha tövbə edirik." (əl-Buxari, 92)

## ٢٠– باب: مَنْ أَعَادَ الحَدِيثَ ثَلاثاً لِيُفْهَمَ عَنْهُ

## 20-ci fəsil. Başa düşülsün deyə, hədisi üç kərə təkrar etmək

٨٢ – عَنْ أَنَسٍ ﷺ، عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ كَانَ إِذَا تَكَلَّمَ بِكَلِمَةٍ أَعَادَهَا ثَلاثًا حَتَّى تُفْهَمَ عَنْهُ، وَإِذَا أَتَى عَلَى قَوْمٍ فَسَلَّمَ عَلَيْهِمْ سَلَّمَ عَلَيْهِمْ ثَلاثًا. [رواه البخاري: ٩٤]

**82.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir söz söylədiyi zaman (söylədiklərini) başa düşsünlər deyə onu üç dəfə təkrar edərdi, bir qövmün yanına gəlib onları salamladıqda üç kərə salam verərdi. (əl-Buxari, 94)

## ٢١– باب: تَعْلِيمُ الرَّجُلِ أَمَتَهُ وَ أَهْلَهُ

## 21-ci fəsil. Kişinin öz kənizinə və zövcəsinə elm öyrətməsi

٨٣ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ «ثَلاثَةٌ لَهُمْ أَجْرَانِ رَجُلٌ مِنْ أَهْلِ الْكِتَابِ آمَنَ بِنَبِيِّهِ، وَآمَنَ بِمُحَمَّدٍ ﷺ وَالْعَبْدُ الْمَمْلُوكُ إِذَا أَدَّى حَقَّ اللَّهِ وَحَقَّ مَوَالِيهِ، وَرَجُلٌ كَانَتْ عِنْدَهُ أَمَةٌ {يطؤها} فَأَدَّبَهَا، فَأَحْسَنَ تَأْدِيبَهَا، وَعَلَّمَهَا فَأَحْسَنَ تَعْلِيمَهَا، ثُمَّ أَعْتَقَهَا فَتَزَوَّجَهَا، فَلَهُ أَجْرَانِ». [رواه البخاري: ٩٧]

**83.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç qisim insan vardır ki, onlar ikiqat savab qazanır: Kitab əhlindən olub öz peyğəmbərinə iman gətirmiş, sonra da Muhəmmədə ﷺ iman gətirən adam; həm Allahın, həm də öz ağalarının haqqını ödəyən kölə; və bir də o kimsə ki, yaxınlıq etdiyi kənizinə yaxşı tərbiyə vermiş, ona gözəl tərzdə elm öyrətmiş, sonra da (o kənizi) azad edib onunla evlənmişdir. Beləsinə də ikiqat savab vardır." (əl-Buxari, 97)

## ٢٢– باب: عِظَةُ الإِمَامِ النِّسَاءَ وَ تَعْلِيمِهِنَّ

## 22-ci fəsil. İmamın qadınlara öyüd-nəsihət verməsi və onlara elm öyrətməsi

٨٤ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ خَرَجَ وَمَعَهُ بِلاَلٌ، فَظَنَّ أَنَّهُ لَمْ يُسْمِعِ النِّسَاءَ فَوَعَظَهُنَّ، وَأَمَرَهُنَّ بِالصَّدَقَةِ، فَجَعَلَتِ الْمَرْأَةُ تُلْقِي الْقُرْطَ وَالْخَاتَمَ، وَبِلاَلٌ يَأْخُذُ فِي طَرَفِ ثَوْبِهِ. [رواه البخاري: ٩٨]

**84.** İbn Abbas ﷺ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ (məsciddə verdiyi xütbəni) qadınlara eşitdirə bilmədiyini zənn edib Bilal ilə birlikdə (onların yanına)

gəldi. O, qadınlara nəsihət edərək onlara sədəqə verməyi buyurdu. Qadınlar sırğalarını və üzüklərini çıxarıb atmağa başladılar. Bilal da onları paltarının ətəyinə yığırdı. (əl-Buxari, 98)

## 23-cü fəsil. Hədis öyrənməyə həris olmaq

## ٢٣– باب: الحِرْصُ عَلَى الحَدِيثِ

٨٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قُلْتُ يَا رَسُولَ اللَّه، مَنْ أَسْعَدُ النَّاسِ بشَفَاعَتكَ يَوْمَ الْقيَامَة قَالَ رَسُولُ اللَّه ﷺ «لَقَدْ ظَنَنْتُ يَا أَبَا هُرَيْرَةَ أَنْ لاَ يَسْأَلَنى عَنْ هَذَا الْحَديث أَحَدٌ أَوَّلُ منْكَ، لمَا رَأَيْتُ منْ حرْصكَ عَلَى الْحَديث، أَسْعَدُ النَّاسِ بشَفَاعَتى يَوْمَ الْقيَامَة مَنْ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، خَالصًا منْ قَلْبه أَوْ نَفْسه». [رواه البخاري: ٩٩]

**85.** Əbu Hureyra ﷺ rəvayət edir ki, mən (Peyğəmbərdən ﷺ): "Ya Rəsulullah! Qiyamət günü sənin şəfaətin sayəsində ən böyük səadətə çatan adam kim olacaq?"– deyə soruşdum. Rəsulallah ﷺ dedi: "Ey Əbu Hureyra! Mən sənin hədis öyrənməyə olan hərisliyini görüb düşünürdüm ki, səndən əvvəl heç kəs bu hədis barəsində məndən soruşmayacaq. Qiyamət günü mənim şəfaətim sayəsində ən böyük səadətə çatanlar, səmimi-qəlblə (yaxud cani-dildən) "La ilahə illəllah"– deyən kimsələr olacaq. (əl-Buxari, 99)

## 24-cü fəsil. Elm necə aradan qaldırılacaq?

## ٢٤– باب: كَيْفَ يُقْبَضُ العِلْمُ

٨٦ – عَنْ عَبْد الله بْنِ عَمْرِو بْن العَاصِ ﷺ قَالَ: سَمعْتُ رَسُولَ اللَّه ﷺ يَقُولُ «إِنَّ اللَّهَ لاَ يَقْبِضُ الْعلْمَ انْتزَاعًا، يَنْتَزِعُهُ منَ الْعبَاد، وَلَكنْ يَقْبِضُ الْعلْمَ بقَبْضِ الْعُلَمَاء، حَتَّى إِذَا لَمْ يُبْقِ عَالمًا، اتَّخَذَ النَّاسُ رُءُوسًا جُهَّالاً فَسُئلُوا، فَأَفْتَوْا بغَيْرِ علْمٍ، فَضَلُّوا وَأَضَلُّوا». [رواه البخاري: ١٠٠]

**86.** Abdullah ibn Amr ibn As ﷺ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Allah, elmi (Öz) qullarının (qəlbindən) silib götürməklə onu aradan qaldırmaz. Lakin O, alimləri aradan götürməklə elmi aradan qaldırar. Nəhayət, bir alim belə saxlamaz. Onda insanlar özlərinə cahil başçılar seçər. Sonra o başçılara suallar verilər və onlar da elmsiz olaraq cavab verərlər. Beləliklə də, həm özləri azğınlığa düşər, həm də insanları azğınlığa salarlar." (əl-Buxari, 100)

## 25-ci fəsil. Elm öyrətmək məqsədilə qadınlar üçün ayrıca bir gün təyin edilə bilərmi?

## ٢٥– باب: هَلْ يُجْعَلُ للنِّسَاءِ يَوْماً فِي العِلْمِ

٨٧ – عَنْ أَبِي سَعيد الخُدْرِيِّ ﷺ قَالَ: قَالَت النِّسَاءُ للنَّبيِّ ﷺ غَلَبَنَا عَلَيْكَ الرِّجَالُ، فَاجْعَلْ لَنَا يَوْمًا منْ نَفْسكَ. فَوَعَدَهُنَّ يَوْمًا لَقيَهُنَّ فيه، فَوَعَظَهُنَّ وَأَمَرَهُنَّ، فَكَانَ فيمَا قَالَ لَهُنَّ «مَا منْكُنَّ امْرَأَةٌ تُقَدِّمُ ثَلاَثَةً منْ وَلَدهَا إِلاَّ كَانَ لَهَا حجَابًا منَ النَّارِ». فَقَالَت امْرَأَةٌ وَاثْنَيْنِ فَقَالَ: «وَاثْنَيْنِ».
وَ فِي رِوَايَةٍ عَنْ أَبِي هُرَيْرَةَ ﷺ: «لَمْ يَبْلُغُوا الْحِنْثَ». [رواه البخاري: ١٠١]

**87.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, (bir gün) qadınlar Peyğəmbərə ﷺ dedilər: "Kişilər bizə (səndən söz soruşmağa) imkan vermirlər. Odur ki, özün bizim üçün bir gün ayır." Elə bu səbəbdən də Peyğəmbər ﷺ qadınlar üçün bir gün ayırdı *və* həmin gün onları qəbul edib onlara öyüd-nəsihət verdi və onlara (bir çox şeyləri) əmr etdi. Qadınlara dediyi sözlər arasında (bu sözlər də) var idi: "Sizlərdən üç övladını itirmiş elə bir qadın yoxdur ki, (bu övladlar) onu oddan qorumaq üçün sipər olmasınlar." Bir Qadın soruşdu: "Bəs ikisi (olsa) necə?" (Peyğəmbər ﷺ) dedi: "İkisi olsa da."

Əbu Hureyranın ﷺ rəvayətində (Peyğəmbər ﷺ): "...həddi-buluğa çatmamış üç övladını..."– demişdir. (əl-Buxari, 101)

## ٢٦– باب:
## مَنْ سَمِعَ شَيْئاً فَرَاجَعَ حَتَّى يَعْرِفَهُ

## 26-cı fəsil. Bir şey eşidib (onu başa düşməyən), sonra da öyrənmək məqsədilə təkrar sual verən kimsə

٨٨ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «مَنْ حُوسِبَ عُذِّبَ». قَالَتْ عَائِشَةُ: فَقُلْتُ أَوَ لَيْسَ يَقُولُ اللَّهُ تَعَالَى: ﴿فَسَوْفَ يُحَاسَبُ حِسَابًا يَسِيرًا﴾ فَقَالَ: «إِنَّمَا ذَلِكَ الْعَرْضُ، وَلَكِنْ مَنْ نُوقِشَ الْحِسَابَ يَهْلِكْ» [رواه البخاري: ١٠٣]

**88.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ: "Kim haqq-hesaba çəkilərsə, əzaba düçar olar"– deyə buyurdu. Mən dedim: "Məgər Uca Allah: "Onunla yüngül haqq-hesab çəkiləcək"[1] – deyə buyurmayırmı?" Peyğəmbər ﷺ dedi: "Sən dediyin ərz etməkdir[2]. (Əməlləri) müzakirə olunacaq kimsə isə həlak olacaq." (əl-Buxari, 103)

## ٢٧– باب:
## لِيُبَلِّغَ الشَاهِدُ الغَائِبَ

## 27-ci fəsil. Qoy burada olanlar (eşitdiklərini) aramızda olmayanlara təbliğ etsinlər.

٨٩ – عَنْ أَبِي شُرَيْحٍ رضي الله عنه قَالَ: سَمِعْتُ رَسُولَ اللهِ ﷺ الْغَدَ مِنْ يَوْمِ الْفَتْحِ، يَقُولُ قَوْلاً، سَمِعَتْهُ أُذُنَايَ وَوَعَاهُ قَلْبِي، وَأَبْصَرَتْهُ عَيْنَايَ، حِينَ تَكَلَّمَ بِهِ، حَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ثُمَّ قَالَ: «إِنَّ مَكَّةَ حَرَّمَهَا اللَّهُ، وَلَمْ يُحَرِّمْهَا النَّاسُ، فَلاَ يَحِلُّ لامْرِئٍ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ أَنْ يَسْفِكَ بِهَا دَمًا، وَلاَ يَعْضِدَ بِهَا شَجَرَةً، فَإِنْ أَحَدٌ تَرَخَّصَ لِقِتَالِ رَسُولِ اللَّهِ ﷺ فِيهَا فَقُولُوا إِنَّ اللَّهَ قَدْ أَذِنَ لِرَسُولِهِ، وَلَمْ يَأْذَنْ لَكُمْ. وَإِنَّمَا أَذِنَ لِي فِيهَا سَاعَةً مِنْ نَهَارٍ، ثُمَّ عَادَتْ حُرْمَتُهَا الْيَوْمَ كَحُرْمَتِهَا بِالأَمْسِ، وَلْيُبَلِّغِ الشَّاهِدُ الْغَائِبَ» [رواه البخاري: ١٠٤]

**89.** Əbu Şureyh ﷺ rəvayət edir ki, mən Məkkənin fəthinin ertəsi günü Rəsulullahın ﷺ dediyi sözləri eşitdim. O sözləri mənim bu qulaqlarım eşitdi, qəlbim duydu və o, bu sözləri söyləyərkən gözlərim onu gördü. (Peyğəmbər ﷺ) Allaha həmd edib Onun şəninə təriflər dedikdən sonra belə buyurdu: "Məkkənin toxunulmaz olduğunu insanlar deyil, məhz Allah buyurmuşdur. Odur ki, Allaha və Axirət gününə iman gətirən adama orada nə qan tökmək, nə də bir ağac baltalamaq halal olmaz. Əgər kimsə Allahın elçisinin ﷺ orada döyüşdüyünü əlin-

[1] "əl-İnşiqaq" surəsi, 8.
[2] Yəni hər kəsin etdiyi əməllər özünə ərz olunacaqdır.

də əsas tutaraq buna rüsxət versə, (ona): "Allah Öz elçisinə izn vermişdir, sizə isə izn verməmişdir"– deyin. O, mənə yalnız bu günün bir saatında belə etməyə izn verdi və bu gün (Məkkə), yenə də dünənki kimi toxunulmaz oldu. Qoy burada olanlar (eşitdiklərini) aramızda olmayanlara təbliğ etsinlər." (əl-Buxari, 104)

## ٢٨– باب: إِثْمُ مَنْ كَذَبَ عَلَى النَّبِيِّ ﷺ

## 28-ci fəsil. Peyğəmbərin ﷺ adından yalan danışan kimsənin günahı

٩٠ – عَنْ عَلِيٍّ ﵁ قَالَ: سَمِعْتُ رَسُولَ اللهِ ﷺ يَقُولُ: «لاَ تَكْذِبُوا عَلَيَّ، فَإِنَّهُ مَنْ كَذَبَ عَلَيَّ فَلْيَتَبَوَّأْ مَقْعَدَهُ مِنَ النَّارِ». [رواه البخاري: ١٠٦]

**90.** Əli ﵁ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Mənim adımdan yalan danışmayın. Kim mənim adımdan yalan danışarsa, qoy Cəhənnəmdəki yerini tutsun." (əl-Buxari, 106)

٩١ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﵁ قَالَ: سَمِعْتُ رَسُولَ اللهِ ﷺ يَقُولُ: «مَنْ يَقُلْ عَلَيَّ مَا لَمْ أَقُلْ فَلْيَتَبَوَّأْ مَقْعَدَهُ مِنَ النَّارِ». [رواه البخاري: ١٠٩]

**91.** Sələmə ibn Əkva ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim mənim demədiyimi mənə isnad etsə, qoy Cəhənnəmdəki yerini tutsun." (əl-Buxari, 109)

٩٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «تَسَمَّوْا بِاسْمِي وَلاَ تَكْتَنُوا بِكُنْيَتِي، وَمَنْ رَآنِي فِي الْمَنَامِ فَقَدْ رَآنِي، فَإِنَّ الشَّيْطَانَ لاَ يَتَمَثَّلُ فِي صُورَتِي، وَمَنْ كَذَبَ عَلَيَّ مُتَعَمِّدًا فَلْيَتَبَوَّأْ مَقْعَدَهُ مِنَ النَّارِ». [رواه البخاري: ١١٠]

**92.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim adımı (bir-birinizə) qoya bilərsiniz, lakin mənim kunyamı[1] (özünüzə) qoymayın. (Onu da bilin ki,) kim məni yuxuda görərsə, (həqiqətən də,) məni görmüş olar. Çünki şeytan mənim qiyafəmə girə bilməz. Və kim mənim adımdan bilərəkdən yalan danışarsa, qoy Cəhənnəmdəki yerini tutsun." (əl-Buxari, 110)

## ٢٩– باب: كِتَابَةُ العِلْمِ

## 29-cu fəsil. Elmi yazmaq

٩٣ – عَنْهُ ﵁ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «إِنَّ اللَّهَ حَبَسَ عَنْ مَكَّةَ الْقَتْلَ – أَوِ الْفِيلَ شَكَّ أَبُو عَبْدِ اللَّهِ – وَسَلَّطَ عَلَيْهِمْ رَسُولَ اللَّهِ ﷺ وَالْمُؤْمِنِينَ، أَلاَ وَإِنَّهَا لَمْ تَحِلَّ لأَحَدٍ قَبْلِي، وَلاَ تَحِلُّ لأَحَدٍ بَعْدِي أَلاَ وَإِنَّهَا حَلَّتْ لِي سَاعَةً مِنْ نَهَارٍ، أَلاَ وَإِنَّهَا سَاعَتِي هَذِهِ حَرَامٌ، لاَ يُخْتَلَى شَوْكُهَا، وَلاَ يُعْضَدُ شَجَرُهَا، وَلاَ تُلْتَقَطُ سَاقِطَتُهَا إِلاَّ لِمُنْشِدٍ، فَمَنْ قُتِلَ فَهُوَ بِخَيْرِ النَّظَرَيْنِ إِمَّا أَنْ يُعْقَلَ، وَإِمَّا أَنْ يُقَادَ أَهْلُ الْقَتِيلِ». فَجَاءَ رَجُلٌ مِنْ أَهْلِ الْيَمَنِ فَقَالَ اكْتُبْ لِي يَا رَسُولَ اللَّهِ. فَقَالَ: «اكْتُبُوا لأَبِي فُلاَنٍ». فَقَالَ رَجُلٌ مِنْ قُرَيْشٍ إِلاَّ الإِذْخِرَ يَا رَسُولَ اللَّهِ، فَإِنَّا نَجْعَلُهُ فِي بُيُوتِنَا وَقُبُورِنَا. فَقَالَ النَّبِيُّ ﷺ «إِلاَّ الإِذْخِرَ، إِلاَّ الإِذْخِرَ». [رواه البخاري: ١١٢]

---

[1] Kunya – ismin əvvəlinə "əbu (ata)", yaxud "ummu (ana)", yaxud "ibn (oğul)", yaxud da "bint (qız)" sözləri ilə başlanan ləqəbdir. Bu hədisdə Peyğəmbərin ﷺ Əbül-Qasım kunyası nəzərdə tutulur.

**93.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allah Məkkədə qətl törətməyə izn verməmiş (və ya filləri oraya buraxmamışdır[1]), üstəlik Məkkə əhalisi üzərində hökmranlığı Peyğəmbərə ﷺ və möminlərə həvalə etmişdir. Agah olun ki, Məkkə[2] məndən əvvəl heç bir kəsə halal olmadığı kimi, məndən sonra da heç bir kəsə halal olmayacaqdır. Bilin ki, o, ancaq bir günün bir saatında təkcə mənim üçün halal buyrulmuşdur. Bilin ki, bu saat o mənim üçün belə haramdır. (Elə buna görə də) Məkkədə tikan kəsilməməli, ağaca balta dəyməməli və itmiş əşya götürülməməlidir. (Əşyanın sahibini) axtarıb tapmaq istəyən (kimsənin götürdüyü) isə istisnadır. (Onu da bilin ki,) qətlə yetirilmiş kimsənin (varisi) iki şeydən birini seçə bilər: ya ona qanbahası verilməli, ya da qatildən qisas almalıdır.” Bu dəmdə Yəməndən olan birisi yaxınlaşıb: “(Bu söylədiklərini) mənim üçün yaz, ya Rəsulullah!”– dedi. (Peyğəmbər ﷺ də): “(Bunu) Əbu Filankəs üçün yazın!”– deyə buyurdu. Sonra Qureyşdən olan birisi: “Ətirli qamışdan başqa, ya Rəsulullah! Axı biz onu evlərimizdə və qəbirlərimizdə istifadə edirik”– dedi. Peyğəmbər ﷺ də: “Ətirli qamışdan başqa, ətirli qamışdan başqa”– deyə buyurdu. (əl-Buxari, 112)

**٩٤ –** عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: لَمَّا اشْتَدَّ بِالنَّبِيِّ ﷺ وَجَعُهُ قَالَ: «ائْتُونِى بِكِتَابٍ أَكْتُبُ لَكُمْ كِتَابًا لاَ تَضِلُّوا بَعْدَهُ». قَالَ عُمَرُ إِنَّ النَّبِيَّ ﷺ غَلَبَهُ الْوَجَعُ وَعِنْدَنَا كِتَابُ اللَّهِ حَسْبُنَا فَاخْتَلَفُوا وَكَثُرَ اللَّغَطُ. قَالَ: «قُومُوا عَنِّى، وَلاَ يَنْبَغِى عِنْدِى التَّنَازُعُ». [رواه البخاري: ١١٤]

**94.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ (ölüm ayağında) ağrıları şiddətlənərkən: “Mənə (üstündə) yazı yazmaq[3] üçün bir şey gətirin, sizə elə bir yazı yazım ki, ondan sonra zəlalətə düşməyəsiniz”– deyə buyurdu. Ömər رضي الله عنه: “Peyğəmbərin ﷺ ağrıları şiddətlənmişdir, bizim əlimizdə Allahın Kitabı var, o bizə kifayət edər”– dedi. Bu vaxt (əshabələr) arasına ixtilaf düşdü, səs-küy qalxdı və Peyğəmbər ﷺ (onlara): “Qalxın yanımdan! Mənim hüzurumda mübahisə etmək olmaz”– deyə buyurdu. (əl-Buxari, 114)

## 30-cu fəsil. Gecə vaxtı elm öyrətmək və moizə vermək

## ٣٠– باب: العِلْمُ و العِظَةُ بِاللَّيْلِ

**٩٥ –** عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها قَالَتْ: اسْتَيْقَظَ النَّبِيُّ ﷺ ذَاتَ لَيْلَةٍ فَقَالَ: «سُبْحَانَ اللَّهِ مَاذَا أُنْزِلَ اللَّيْلَةَ مِنَ الْفِتَنِ وَمَاذَا فُتِحَ مِنَ الْخَزَائِنِ أَيْقِظُوا صَوَاحِبَاتِ الْحُجَرِ، فَرُبَّ كَاسِيَةٍ فِى الدُّنْيَا عَارِيَةٍ فِى الآخِرَةِ». [رواه البخاري: ١١٥]

**95.** Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, bir gecə Peyğəmbər ﷺ yuxudan oyanıb belə buyurdu: “Subhanəllah! Bu gecə necə bəlalar nazil oldu, necə xəzinələr açıldı! Hücrələrin sahiblərini (möminlərin analarını) oyadın. Bu dünyada əynində paltarı olan neçə-neçə qadınlar vardır ki, axirətdə lüt-üryan olacaqlar.” (əl-Buxari, 115)

---

[1] Əbu Abdullah əl-Buxari bu ifadələrdən hansı birininin daha düzgün olduğuna şəkk etmişdir. Belə ki, ərəbcə “qətl – القتل” və “fil – الفيل” kəlmələrinin fərqini yalnız nöqtələrə görə bilmək olar. Elə bu səbəbdən də hədisi nəql etmiş ravi şəkk etmişdir.

Burada fillər deyildikdə miladi tarixlə 570-ci ildə, Kəbənin yaxınlığında həbəşistanlı Əbrəhə əl-Əşrəm və onun ordusunun başına gəlmiş məşhur hadisə qəsd edilir.

[2] Yəni Allahın qadağan etdiyi işləri Məkkədə etmək.

[3] Yəni yazdırmaq üçün.

## ٣١– باب: السَمَرُ فِي العِلْمِ

## 31-ci fəsil. Elm almaq xatirinə gecə oyaq qalıb söhbət etmək

٩٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: صَلَّى بِنَا النَّبِيُّ ﷺ الْعِشَاءَ فِي آخِرِ حَيَاتِهِ، فَلَمَّا سَلَّمَ قَامَ فَقَالَ: «أَرَأَيْتَكُمْ لَيْلَتَكُمْ هَذِهِ، فَإِنَّ رَأْسَ مِائَةِ سَنَةٍ مِنْهَا لاَ يَبْقَى مِمَّنْ هُوَ عَلَى ظَهْرِ الأَرْضِ أَحَدٌ». [رواه البخاري: ١١٦]

**96.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ həyatının sonunda bizə işa namazını qıldırdı. Salam verib (namazı bitirdikdən) sonra ayağa qalxıb dedi: “Bu gecənizi görürsünüzmü?! Həqiqətən, bu gecədən etibarən yüz ilin tamamında (indi) yer üzündə olanlardan heç bir kəs qalmayacaqdır.” (əl-Buxari, 116)

٩٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ، بِتُّ فِي بَيْتِ خَالَتِي مَيْمُونَةَ بِنْتِ الْحَارِثِ زَوْجِ النَّبِيِّ ﷺ وَكَانَ النَّبِيُّ ﷺ عِنْدَهَا فِي لَيْلَتِهَا، فَصَلَّى النَّبِيُّ ﷺ الْعِشَاءَ، ثُمَّ جَاءَ إِلَى مَنْزِلِهِ، فَصَلَّى أَرْبَعَ رَكَعَاتٍ، ثُمَّ نَامَ، ثُمَّ قَامَ، ثُمَّ قَالَ: «نَامَ الْغُلَيِّمُ». أَوْ كَلِمَةً تُشْبِهُهَا، ثُمَّ قَامَ فَقُمْتُ عَنْ يَسَارِهِ، فَجَعَلَنِي عَنْ يَمِينِهِ، فَصَلَّى خَمْسَ رَكَعَاتٍ ثُمَّ صَلَّى رَكْعَتَيْنِ، ثُمَّ نَامَ حَتَّى سَمِعْتُ غَطِيطَهُ – أَوْ خَطِيطَهُ – ثُمَّ خَرَجَ إِلَى الصَّلاَةِ. [رواه البخاري: ١١٧]

**97.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, mən Peyğəmbərin ﷺ zövcəsi – xalam Meymunə bint Harisin evində gecələdim. O gecə Peyğəmbər ﷺ də onun yanında idi. Peyğəmbər ﷺ işa namazını (məsciddə) qıldıqdan sonra mənzilinə qayıtdı və dörd rükət namaz qıldı. Sonra da uzanıb yatdı. (Bir müddət keçdikdən) sonra o oyanıb: “Uşaq yatdımı?”– deyə soruşdu (və ya buna bənzər bir söz dedi). Sonra o, namaz qılmağa durdu, mən də gəlib onun sol tərəfində durdum. O, məni sağ tərəfinə keçirtdi və beş rükət namaz qıldı. Bunun ardından iki rükət də qıldı. Sonra da uzanıb yatdı. Nəhayət, mən onun xorultusunu eşitdim. (Bir müddət keçdikdən) sonra isə qalxıb namaza getdi. (əl-Buxari, 117)

## ٣٢– باب: حِفْظُ العِلْمِ

## 32-ci fəsil. Elmi qorumaq

٩٨ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ، إِنَّ النَّاسَ يَقُولُونَ أَكْثَرَ أَبُو هُرَيْرَةَ، وَلَوْلاَ آيَتَانِ فِي كِتَابِ اللَّهِ مَا حَدَّثْتُ حَدِيثًا، ثُمَّ يَتْلُو ﴿إِنَّ ٱلَّذِينَ يَكْتُمُونَ مَآ أَنزَلْنَا مِنَ ٱلْبَيِّنَٰتِ﴾ إِلَى قَوْلِهِ ﴿ٱلرَّحِيمُ﴾ إِنَّ إِخْوَانَنَا مِنَ الْمُهَاجِرِينَ كَانَ يَشْغَلُهُمُ الصَّفْقُ بِالأَسْوَاقِ، وَإِنَّ إِخْوَانَنَا مِنَ الأَنْصَارِ كَانَ يَشْغَلُهُمُ الْعَمَلُ فِي أَمْوَالِهِمْ، وَإِنَّ أَبَا هُرَيْرَةَ كَانَ يَلْزَمُ رَسُولَ اللَّهِ ﷺ بِشِبَعِ بَطْنِهِ وَيَحْضُرُ مَا لاَ يَحْضُرُونَ، وَيَحْفَظُ مَا لاَ يَحْفَظُونَ. [رواه البخاري: ١١٨]

**98.** Əbu Hureyra رضي الله عنه belə demişdir: “İnsanlar: “Əbu Hureyra çox hədis danışır”– deyirlər. Halbuki Allahın Kitabındakı bu iki ayə olmasaydı, bir hədis belə rəvayət etməzdim.”

Sonra Əbu Hureyra رضي الله عنه (bu ayələri) oxudu: “Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlilləri və doğru yol göstərən ayələri nazil etdikdən sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar! Yalnız tövbə edənlər, *əməllərini* islah edənlər və *haqqı* bəyan edənlər istisnadır. Mən onların tövbəsini qəbul edərəm. Mən tövbələri qəbul edənəm,

Rəhmliyəm!"[1] (Bunun ardınca da belə dedi:) "Mühacir[2] qardaşlarımız bazarlarda alış-verişlə, ənsar qardaşlarımız isə mal-dövlətlərini yerbəyer etməklə məşğul idilər, o vaxt Əbu Hureyra bir qarın yeməklə kifayətlənərək Peyğəmbərdən ﷺ ayrılmaz, onların iştirak etmədikləri məclislərdə iştirak edər və yadda saxlamadıqları (sözləri) yadında saxlayardı." (əl-Buxari, 118)

٩٩ – عَنْهُ ﷺ قَالَ: قُلْتُ يَا رَسُولَ اللَّهِ، إِنِّى أَسْمَعُ مِنْكَ حَدِيثًا كَثِيرًا أَنْسَاهُ. قَالَ: «ابْسُطْ رِدَاءَكَ» فَبَسَطْتُهُ. قَالَ فَغَرَفَ بِيَدَيْهِ ثُمَّ قَالَ: «ضُمَّهُ» فَضَمَمْتُهُ فَمَا نَسِيتُ شَيْئًا بَعْدَهُ. [رواه البخاري: ١١٩]

**99.** Əbu Hureyra ﷺ rəvayət edir ki, mən (Peyğəmbərə ﷺ) dedim: "Ya Rəsulullah! Mən səndən çoxlu hədislər eşidirəm, lakin (onları) unuduram." Peyğəmbər ﷺ: "Paltarının ətəyini aç!"– dedi. Mən paltarımın ətəyini açdıqda Peyğəmbər ﷺ əlləri ilə (sanki nəsə) ovuclayıb (paltarımın ətəyinə) atdı və: "Ətəyini ört"– dedi. Mən onu örtdüm və bundan sonra heş bir şey unutmadım. (əl-Buxari, 119)

١٠٠ – عَنْهُ ﷺ قَالَ، حَفِظْتُ مِنْ رَسُولِ اللَّهِ ﷺ وِعَاءَيْنِ، فَأَمَّا أَحَدُهُمَا فَبَثَثْتُهُ، وَأَمَّا الآخَرُ فَلَوْ بَثَثْتُهُ قُطِعَ هَذَا الْبُلْعُومُ. [رواه البخاري: ١٢٠]

**100.** Əbu Hureyra ﷺ belə demişdir: "Mən Peyğəmbərdən ﷺ iki cür elm öyrəndim. Bunlardan birini (insanlar arasında) yaydım. Digərinə gəlincə, əgər mən onu yaysaydım, (mənim) bu boğazımı üzərdilər." (əl-Buxari, 120)

## 33-cü fəsil. Alimlərin (söylədiklərini) susub dinləmək

## ٣٣– باب: الإِنْصَاتُ لِلعُلَمَاءِ

١٠١ – عَنْ جَرِيرٍ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ لَهُ فِى حَجَّةِ الْوَدَاعِ: «اسْتَنْصِتِ النَّاسَ» فَقَالَ: «لاَ تَرْجِعُوا بَعْدِى كُفَّارًا يَضْرِبُ بَعْضُكُمْ رِقَابَ بَعْضٍ». [رواه البخاري: ١٢١]

**101.** Cərir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ vida həccində ona: "İnsanlara susub dinləməyi əmr et"– dedi. (Hamı susduqdan) sonra o, belə buyurdu: "Məndən sonra bir-birinin boynunu vuran kafirlərdən olmayın!" (əl-Buxari, 121)

## 34-cü fəsil. "İnsanların ən elmlisi kimdir"– deyə soruşulacağı zaman alimin verdiyi cavab

## ٣٤– باب: مَا يُسْتَحَبُّ لِلعَالِمِ إِذَا سُئِلَ: أَيُّ النَّاسِ أَعْلَمُ؟

١٠٢ – عَنْ أُبَيِّ بْنِ كَعْبٍ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «قَامَ مُوسَى النَّبِيُّ خَطِيبًا فِى بَنِى إِسْرَائِيلَ، فَسُئِلَ أَىُّ النَّاسِ أَعْلَمُ فَقَالَ أَنَا أَعْلَمُ. فَعَتَبَ اللَّهُ عَلَيْهِ، إِذْ لَمْ يَرُدَّ الْعِلْمَ إِلَيْهِ، فَأَوْحَى اللَّهُ إِلَيْهِ أَنَّ عَبْدًا مِنْ عِبَادِى بِمَجْمَعِ الْبَحْرَيْنِ هُوَ

---

[1] "əl-Bəqərə" surəsi, 159-160.

[2] Məkkə fəth edilənə qədər digər şəhərlərdən və vilayətlərdən Mədinəyə köçmüş Muhəmməd Peyğəmbərin ﷺ əshabələridir.

أَعْلَمُ مِنْكَ. قَالَ يَا رَبِّ وَكَيْفَ بِهِ فَقِيلَ لَهُ احْمِلْ حُوتًا فِى مِكْتَلٍ فَإِذَا فَقَدْتَهُ فَهْوَ ثَمَّ، فَانْطَلَقَ وَانْطَلَقَ بِفَتَاهُ يُوشَعَ بْنِ نُونٍ، وَحَمَلاَ حُوتًا فِى مِكْتَلٍ، حَتَّى كَانَا عِنْدَ الصَّخْرَةِ وَضَعَا رُءُوسَهُمَا وَنَامَا فَانْسَلَّ الْحُوتُ مِنَ الْمِكْتَلِ فَاتَّخَذَ سَبِيلَهُ فِى الْبَحْرِ سَرَبًا، وَكَانَ لِمُوسَى وَفَتَاهُ عَجَبًا، فَانْطَلَقَا بَقِيَّةَ لَيْلَتِهِمَا وَيَوْمِهِمَا فَلَمَّا أَصْبَحَ قَالَ مُوسَى لِفَتَاهُ آتِنَا غَدَاءَنَا، لَقَدْ لَقِينَا مِنْ سَفَرِنَا هَذَا نَصَبًا، وَلَمْ يَجِدْ مُوسَى مَسًّا مِنَ النَّصَبِ حَتَّى جَاوَزَ الْمَكَانَ الَّذِى أُمِرَ بِهِ. فَقَالَ لَهُ فَتَاهُ أَرَأَيْتَ إِذْ أَوَيْنَا إِلَى الصَّخْرَةِ فَإِنِّى نَسِيتُ الْحُوتَ، قَالَ مُوسَى ذَلِكَ مَا كُنَّا نَبْغِى، فَارْتَدَّا عَلَى آثَارِهِمَا قَصَصًا، فَلَمَّا انْتَهَيَا إِلَى الصَّخْرَةِ إِذَا رَجُلٌ مُسَجًّى بِثَوْبٍ – أَوْ قَالَ تَسَجَّى بِثَوْبِهِ – فَسَلَّمَ مُوسَى. فَقَالَ الْخَضِرُ وَأَنَّى بِأَرْضِكَ السَّلاَمُ فَقَالَ أَنَا مُوسَى. فَقَالَ مُوسَى بَنِى إِسْرَائِيلَ قَالَ نَعَمْ. قَالَ هَلْ أَتَّبِعُكَ عَلَى أَنْ تُعَلِّمَنِى مِمَّا عُلِّمْتَ رَشَدًا قَالَ إِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِىَ صَبْرًا، يَا مُوسَى إِنِّى عَلَى عِلْمٍ مِنْ عِلْمِ اللَّهِ عَلَّمَنِيهِ لاَ تَعْلَمُهُ أَنْتَ، وَأَنْتَ عَلَى عِلْمٍ عَلَّمَكَهُ لاَ أَعْلَمُهُ. قَالَ سَتَجِدُنِى إِنْ شَاءَ اللَّهُ صَابِرًا، وَلاَ أَعْصِى لَكَ أَمْرًا، فَانْطَلَقَا يَمْشِيَانِ عَلَى سَاحِلِ الْبَحْرِ لَيْسَ لَهُمَا سَفِينَةٌ، فَمَرَّتْ بِهِمَا سَفِينَةٌ ، فَكَلَّمُوهُمْ أَنْ يَحْمِلُوهُمَا، فَعُرِفَ الْخَضِرُ، فَحَمَلُوهُمَا بِغَيْرِ نَوْلٍ، فَجَاءَ عُصْفُورٌ فَوَقَعَ عَلَى حَرْفِ السَّفِينَةِ، فَنَقَرَ نَقْرَةً أَوْ نَقْرَتَيْنِ فِى الْبَحْرِ. فَقَالَ الْخَضِرُ يَا مُوسَى، مَا نَقَصَ عِلْمِى وَعِلْمُكَ مِنْ عِلْمِ اللَّهِ إِلاَّ كَنَقْرَةِ هَذَا الْعُصْفُورِ فِى الْبَحْرِ. فَعَمَدَ الْخَضِرُ إِلَى لَوْحٍ مِنْ أَلْوَاحِ السَّفِينَةِ فَنَزَعَهُ. فَقَالَ مُوسَى قَوْمٌ حَمَلُونَا بِغَيْرِ نَوْلٍ، عَمَدْتَ إِلَى سَفِينَتِهِمْ فَخَرَقْتَهَا لِتُغْرِقَ أَهْلَهَا قَالَ أَلَمْ أَقُلْ إِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِىَ صَبْرًا قَالَ لاَ تُؤَاخِذْنِى بِمَا نَسِيتُ. فَكَانَتِ الأُولَى مِنْ مُوسَى نِسْيَانًا. فَانْطَلَقَا فَإِذَا غُلاَمٌ يَلْعَبُ مَعَ الْغِلْمَانِ، فَأَخَذَ الْخَضِرُ بِرَأْسِهِ مِنْ أَعْلاَهُ فَاقْتَلَعَ رَأْسَهُ بِيَدِهِ. فَقَالَ مُوسَى أَقَتَلْتَ نَفْسًا زَكِيَّةً بِغَيْرِ نَفْسٍ قَالَ أَلَمْ أَقُلْ لَكَ إِنَّكَ لَنْ تَسْتَطِيعَ مَعِىَ صَبْرًا – قَالَ ابْنُ عُيَيْنَةَ وَهَذَا أَوْكَدُ – فَانْطَلَقَا حَتَّى إِذَا أَتَيَا أَهْلَ قَرْيَةٍ اسْتَطْعَمَا أَهْلَهَا، فَأَبَوْا أَنْ يُضَيِّفُوهُمَا، فَوَجَدَا فِيهَا جِدَارًا يُرِيدُ أَنْ يَنْقَضَّ فَأَقَامَهُ. قَالَ الْخَضِرُ بِيَدِهِ فَأَقَامَهُ. فَقَالَ لَهُ مُوسَى لَوْ شِئْتَ لاَتَّخَذْتَ عَلَيْهِ أَجْرًا. قَالَ هَذَا فِرَاقُ بَيْنِى وَبَيْنِكَ». قَالَ النَّبِىُّ ﷺ «يَرْحَمُ اللَّهُ مُوسَى، لَوَدِدْنَا لَوْ صَبَرَ حَتَّى يُقَصَّ عَلَيْنَا مِنْ أَمْرِهِمَا». [رواه البخاري: ١٢٢]

**102.** Ubey ibn Kəb ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə demişdir: "Bir dəfə Musa İsrail oğullarına xütbə verərkən ondan: "İnsanların ən elmlisi kimdir?"– deyə soruşdular. Musa: "Ən elmli adam mənəm!"– dedi. Allah da buna görə onu qınadı. Çünki Musa bu haqda bilginin yalnız Allaha məxsus olduğunu demədi. Sonra Allah ona belə vəhy etdi: "İki dənizin qovuşduğu yerdə Mənim səndən çox bilən bir qulum vardır." Musa dedi: "Ey Rəbbim! Mən onu necə tapa bilərəm?" Allah buyurdu: "Zənbilə bir balıq qoy (və yola düş); balığı harada itirsən, həmin adamı orada tapacaqsan." Musa xidmətçisi Yuşə ibn Nunla birgə yola düşdü və özləri ilə zənbildə bir balıq götürdü. Nəhayət, gəlib bir qayanın yanına çatdıqda başlarını yerə qoyub yatdılar. Bu əsnada balıq səkitcə zənbildən çıxıb dənizə düşdü və suyun altı ilə yol alıb getdi. (Balığın suyun altı ilə yol alıb getməsi) Musaya və onun xidmətçisinə qəribə gəlmişdi. (Sonra qalxıb) gecənin qalan hissəsini və bütün günü yol getdilər. Nəhayət, ertəsi gün səhər Musa öz xidmətçisinə: "Nahar yeməyimizi gətir. Biz bu səfərimizdə lap əldən düşdük"– dedi. Musa Allahın buyurduğu yerdən gəlib keçincəyə qədər yorğunluq hiss etməmişdi. Xidmətçisi ona dedi: "Qayanın yanında gizləndiyimiz vaxt yadına gəlirmi? (O zaman) mən balığı unutdum." Musa dedi: "Elə istədiyimiz də bu idi!" Sonra onlar öz ləpirlərinin izinə düşüb geri qayıtdılar." Nəhayət, qayanın yanına gəlib çatdıqda, orada əbasına bürünmüş bir adama rast gəldilər. Musa ona salam verdi. Xədir soruşdu: "Sənin məmləkətində belə sa-

lam verməyi haradan öyrəniblər?" O: "Mən Musayam!"– dedi. Xədir soruşdu: "İsrail oğullarından olan Musa?" Musa: "Bəli!"– deyə cavab verdi, sonra da (əlavə edib) dedi: "Sənə öyrədilmiş doğru yolu (göstərən elmdən) mənə öyrətmək şərtilə sənin arxanca gələ bilərəmmi?" Xədir dedi: "Doğrusu, sən mənim yanımda səbir edə bilməzsən. Ey Musa! Mən Allahın mənə öyrətdiyi və sənin bilmədiyin bir elmi bilirəm. Sən də Allahın sənə öyrətdiyi və mənim bilmədiyim bir elmi bilirsən." Musa dedi: "İnşallah, səbirli olduğumu görəcəksən. Sənin heç bir əmrindən çıxmayacağam." Sonra hər ikisi, gəmiləri olmadığından dənizin sahili ilə piyada getməyə başladılar. Bu əsnada bir gəmiyə rast gəldilər və onun yiyələrindən onları da gəmiyə götürməyi xahiş etdilər. Gəmidəkilər Xədiri tanıdıqlarına görə, onlardan muzd almadan hər ikisini gəmiyə götürdülər. Bu ərəfədə balaca bir sərçə gəlib gəminin yan tərəfinə qondu və dənizdən bir-iki damla su içdi. Xədir dedi: "Ey Musa! Mənim və sənin elmin bu sərçənin dənizdən götürdüyü bir-iki damla su qədər belə Allahın elmini əksiltməz." Sonra Xədir gəminin lövhələrindən birini sındırdı. Musa dedi: "Bu adamlar təmənnasız bizi gəmiyə götürdükləri halda sən onları suya qərq etmək üçünmü onların gəmilərini deşdin?!" Xədir dedi: "Mən demədimmi ki, sən mənim yanımda səbir edə bilməzsən?" Musa dedi: "Unutduğum bir şeydən ötrü məni qınama." Birinci dəfə Musa unutduğundan belə dedi. Sonra ikisi də yenə yola düzəldilər. Nəhayət, gəlib uşaqlarla oynayan bir oğlan uşağı ilə rastlaşdıqda Xədir onu tutub əli ilə başını üzdü. Musa dedi: "Heç kəsi öldürməyən günahsız bir canamı qəsd etdin?" Xədir dedi: "Sənə demədimmi ki, mənim yanımda səbr edə bilməzsən?" Sonra yenə yola düzəldilər. Nəhayət, bir kənd əhlinin yanına gəlib camaatdan yeməyə bir şey istədilər. Lakin camaat onları yeməyə qonaq etmək istəmədi. Onlar orada dağılmaq istəyən bir divar gördülər və Xədir öz əli ilə onu düzəltdi. Musa dedi: "Əgər istəsəydin, bunun müqabilində zəhmət haqqı alardın." Xədir dedi: "Bu, mənimlə sənin aranda ayrılıqdır."

Peyğəmbər ﷺ dedi: "Allah Musaya rəhm etsin! Kaş, səbir edəydi, onda onların barəsində bizə daha çox xəbər verilərdi." (əl-Buxari, 122)

## 35-ci fəsil.
## Özü ayaq üstə olduğu halda, oturan alimə sual verən kimsə

## ٣٥– باب:
## مَنْ سَأَلَ وَ هُوَ قَائِمٌ عَالِماً جَالِساً

١٠٣ – عَنْ أَبِي مُوسَى رضي الله عنه قَالَ: جَاءَ رَجُلٌ إِلَى النَّبِيِّ ﷺ فَقَالَ يَا رَسُولَ اللَّه، مَا الْقِتَالُ فِى سَبِيلِ اللَّه فَإِنَّ أَحَدَنَا يُقَاتِلُ غَضَبًا، وَيُقَاتِلُ حَمِيَّةً. فَقَالَ: «مَنْ قَاتَلَ لِتَكُونَ كَلِمَةُ اللَّهِ هِىَ الْعُلْيَا فَهُوَ فِى سَبِيلِ اللَّهِ عَزَّ وَجَلَّ». [رواه البخاري: ١٢٣]

**103.** Əbu Musa رضي الله عنه rəvayət edir ki, bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ey Allahın elçisi! Allah yolunda vuruşmaq nə deməkdir? Axı bizlərdən kimisi qəzəbinə görə, kimisi də namusuna görə vuruşur." Peyğəmbər ﷺ buyurdu: "Hər kim Allahın Kəlməsi hər şeydən uca olsun deyə vuruşarsa, Allah عز وجل yolunda (vuruşmuş) olar." (əl-Buxari, 123)

## 36-cı fəsil. Uca Allahın: «Sizə yalnız az bir bilik verilmişdir»[1] – sözü

## ٣٦– باب: قَوْلُ الله تَعَالَى: ﴿وَمَآ أُوتِيتُم مِّنَ ٱلْعِلْمِ إِلَّا قَلِيلًا﴾

١٠٤ – وَ عَنْ ابْنِ مَسْعُود ﷺ قَالَ: بَيْنَا أَنَا أَمْشِى مَعَ النَّبِيِّ ﷺ فِى خَرِبِ الْمَدِينَة، وَهُوَ يَتَوَكَّأُ عَلَى عَسِيبٍ مَعَهُ، فَمَرَّ بِنَفَرٍ مِنَ الْيَهُود، فَقَالَ بَعْضُهُمْ لِبَعْضٍ سَلُوهُ عَنِ الرُّوحِ. وَقَالَ بَعْضُهُمْ لاَ تَسْأَلُوهُ لاَ يَجِيءُ فِيهِ بِشَيْءٍ تَكْرَهُونَهُ. فَقَالَ بَعْضُهُمْ لَنَسْأَلَنَّهُ. فَقَامَ رَجُلٌ مِنْهُمْ فَقَالَ يَا أَبَا الْقَاسِمِ، مَا الرُّوحُ فَسَكَتَ. فَقُلْتُ إِنَّهُ يُوحَى إِلَيْه. فَقُمْتُ، فَلَمَّا انْجَلَى عَنْهُ، قَالَ: ﴿وَيَسْـَٔلُونَكَ عَنِ ٱلرُّوحِۖ قُلِ ٱلرُّوحُ مِنْ أَمْرِ رَبِّي وَمَآ أُوتِيتُم مِّنَ ٱلْعِلْمِ إِلَّا قَلِيلًا﴾ [رواه البخاري: ١٢٥]

**104.** İbn Məsud ﷺ rəvayət edir ki, mən Peyğəmbərlə ﷺ birgə Mədinə xarabalıqlarının birindən keçirdim. Peyğəmbər ﷺ xurma ağacından olan bir əsaya söykənə–söykənə gedirdi. Bu vaxt biz bir dəstə yəhudinin yanından keçərkən onlar bir-birlərinə: “Ondan ruh barəsində soruşun”– dedilər. Onlardan bəziləri: “Soruşmayın! Ola bilsin ki, onun verdiyi cavab sizin xoşunuza gəlməsin *(sizdə şübhə oyatsın)*”, digərləri isə: “Yox! Mütləq soruşacağıq”– dedilər. Bir kişi ayağa qalxıb: “Ey Əbul-Qasım! Ruh nədir?”– deyə soruşdu. Peyğəmbər ﷺ susdu. Mən öz-özümə: “Yəqin ki, ona vəhy nazil olur”– dedim və ayağa qalxdım. Vəhy nazil olduqdan sonra Peyğəmbər ﷺ bu ayəni onlara oxudu: “Səndən ruh haqqında soruşurlar. De: “Ruh Rəbbimin əmrindəndir. Sizə yalnız az bir bilik verilmişdir.” (əl-Buxari, 125)

## 37-ci fəsil. Anlamayacaqlarından qorxduğundan elmi bir toplumdan gizlədərək digərlərinə öyrədən kimsə

## ٣٧– باب: مَنْ خَصَّ بِالعِلْمِ قَوْماً دُونَ قَوْمٍ كَرَاهِيَّةَ أَنْ لا يَفْقَهُوا

١٠٥ – عَنْ أَنَسٍ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ وَمُعَاذٌ رَدِيفُهُ عَلَى الرَّحْلِ قَالَ: «يَا مُعَاذُ بْنَ جَبَلٍ». قَالَ: لَبَّيْكَ يَا رَسُولَ اللَّه وَسَعْدَيْكَ . قَالَ «يَا مُعَاذُ». قَالَ لَبَّيْكَ يَا رَسُولَ اللَّه وَسَعْدَيْكَ. ثَلاَثًا. قَالَ: «مَا مِنْ أَحَدٍ يَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّه صِدْقًا مِنْ قَلْبِه إِلاَّ حَرَّمَهُ اللَّهُ عَلَى النَّارِ». قَالَ يَا رَسُولَ اللَّه، أَفَلاَ أُخْبِرُ بِهِ النَّاسَ فَيَسْتَبْشِرُوا قَالَ «إِذًا يَتَّكِلُوا». وَأَخْبَرَ بِهَا مُعَاذٌ عِنْدَ مَوْتِهِ تَأَثُّمًا. [رواه البخاري: ١٢٨]

**105.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Muazla birlikdə dəvənin tərkində ikən: “Ey Muaz!”– deyə çağırdı. (Muaz): “Buyur, əmrinə müntəzirəm, ya Rəsulullah!”– deyə cavab verdi. (Peyğəmbər ﷺ) yenə: “Ey Muaz!”– deyə çağırdı. O: “Buyur, əmrinə müntəzirəm, ya Rəsulullah!”– deyə cavab verdi. Bu hal üç dəfə təkrar olduqdan sonra Peyğəmbər ﷺ dedi: “Allahdan başqa *ibadətə layiq* məbud olmadığına və Muhəmmədin Allahın elçisi olduğuna sidq ürəkdən şəhadət verən elə bir kəs yoxdur ki, Allah ona Cəhənnəm odunu haram etməsin.” (Muaz) dedi: “Ya Rəsulullah! Bunu insanlara xəbər verimmi ki, sevinsinlər?” Peyğəmbər ﷺ dedi: “Belə olduğu təqdirdə (buna) arxayın olacaqlar.”

[1] “əl-İsra” surəsi, 85.

Muaz günaha batacağından qorxub ölümündən qabaq bu haqda (insanlara) xəbər verdi. (əl-Buxari, 128)

## 38-ci fəsil. Elm (aldıqda) utanmaq

## ٣٨– باب: الحَيَاءُ فِي العِلْمِ

١٠٦ – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها قَالَتْ: جَاءَتْ أُمُّ سُلَيْمٍ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَتْ يَا رَسُولَ اللَّهِ إِنَّ اللَّهَ لاَ يَسْتَحْيِي مِنَ الْحَقِّ، فَهَلْ عَلَى الْمَرْأَةِ مِنْ غُسْلٍ إِذَا احْتَلَمَتْ قَالَ النَّبِيُّ ﷺ «إِذَا رَأَتِ الْمَاءَ». فَغَطَّتْ أُمُّ سَلَمَةَ – تَعْنِى وَجْهَهَا – وَقَالَتْ يَا رَسُولَ اللَّهِ وَتَحْتَلِمُ الْمَرْأَةُ قَالَ «نَعَمْ تَرِبَتْ يَمِينُكِ فَبِمَ يُشْبِهُهَا وَلَدُهَا». [رواه البخاري: ١٣٠]

**106.** Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, Ummu Süleym Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah! Allah haqqı deməkdən həya etməz. Qadın pollyusiya[1] halına düşdükdə qüsl etməlidirmi?" Peyğəmbər ﷺ buyurdu: "Bəli, əgər su görübsə (məni axıdıbsa,) etməlidir!" Ummu Sələmə (utandığından) üzünü yaşmaqla örtdü və: "Ya Rəsulullah! Heç qadın da pollyusiya halına düşə bilərmi?"– deyə soruşdu. Peyğəmbər ﷺ dedi: "Əlbəttə, (düşə bilər). Ay yazıq! Belə olmasa, övladı ona necə oxşaya bilər?" (əl-Buxari, 130)

## 39-cu fəsil. (Alimdən söz soruşmağa) utanıb sual verməyi başqasına əmr edən kimsə

## ٣٩– باب: مَنْ اسْتَحْيَا فَأَمَرَ غَيْرَهُ بِالسُّؤَالِ

١٠٧ – عَنْ عَلِيٍّ رضي الله عنه قَالَ: كُنْتُ رَجُلاً مَذَّاءً فَأَمَرْتُ الْمِقْدَادَ أَنْ يَسْأَلَ النَّبِيَّ ﷺ فَسَأَلَهُ فَقَالَ: «فِيهِ الْوُضُوءُ». [رواه البخاري: ١٣٢]

**107.** Əli ibn Əbu Talib رضي الله عنه rəvayət edir ki, məndən tez-tez məzi axırdı. *Utandığımdan* Miqdadı Peyğəmbərin ﷺ yanına göndərdim ki, (bunun hökmünü) ondan soruşsun. O, (bunun hökmünü) Peyğəmbərdən ﷺ soruşduqda o: "(Belə olduqda,) dəstəmaz alsın!"– deyə buyurdu. (əl-Buxari, 132)

## 40-cı fəsil. Məsciddə elm öyrətmək və fitva vermək

## ٤٠– باب: ذِكْرُ العِلْمِ وَ الفُتْيَا فِي المَسْجِدِ

١٠٨ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما، أَنَّ رَجُلاً قَامَ فِى الْمَسْجِدِ فَقَالَ يَا رَسُولَ اللَّهِ، مِنْ أَيْنَ تَأْمُرُنَا أَنْ نُهِلَّ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «يُهِلُّ أَهْلُ الْمَدِينَةِ مِنْ ذِى الْحُلَيْفَةِ، وَيُهِلُّ أَهْلُ الشَّأْمِ مِنَ الْجُحْفَةِ، وَيُهِلُّ أَهْلُ نَجْدٍ مِنْ قَرْنٍ».
وَقَالَ ابْنُ عُمَرَ وَيَزْعُمُونَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «وَيُهِلُّ أَهْلُ الْيَمَنِ مِنْ يَلَمْلَمَ». وَكَانَ ابْنُ عُمَرَ يَقُولُ لَمْ أَفْقَهْ هَذِهِ مِنْ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ١٣٣]

---

[1] Pollyusiya – yuxuda ikən sperma axıtmaqdır.

**108.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, bir nəfər məsciddə ayağa qalxıb: “Ya Rəsulullah! Bizə haradan ihrama girməyi[1] əmr edirsən?”– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: “Mədinə əhalisi zül-Hüleyfədən, Şam əhalisi Cühfədən və Nəcd əhalisi Qərndən ihrama girsinlər.” İbn Ömər رضي الله عنهما (rəvayətinə davam edib) dedi: “İddia edirlər ki, Peyğəmbər ﷺ: “Yəmən əhalisi Yələmləmdən ihrama girsin”– demişdir.

İbn Ömər رضي الله عنهما, həmçinin deyərdi: “Mən bu (son) sözü Peyğəmbərdən ﷺ eşitməmişəm.” (əl-Buxari, 133)

## ٤٠– باب:
## مَنْ أَجَابَ السَّائِلَ بِأَكْثَرَ مِمَّا سَأَلَهُ

## 41-ci fəsil.
## Soruşan adama soruşduğundan artıq cavab verən kimsə

**١٠٩** – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما، عَنِ النَّبِيِّ ﷺ أَنَّ رَجُلاً سَأَلَهُ مَا يَلْبَسُ الْمُحْرِمُ فَقَالَ: «لاَ يَلْبَسِ الْقَمِيصَ وَلاَ الْعِمَامَةَ وَلاَ السَّرَاوِيلَ وَلاَ الْبُرْنُسَ وَلاَ ثَوْبًا مَسَّهُ الْوَرْسُ أَوِ الزَّعْفَرَانُ، فَإِنْ لَمْ يَجِدِ النَّعْلَيْنِ فَلْيَلْبَسِ الْخُفَّيْنِ وَلْيَقْطَعْهُمَا حَتَّى يَكُونَا تَحْتَ الْكَعْبَيْنِ». [رواه البخاري: ١٣٤]

**109.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ: “İhrama girən kəs əyninə nə geyinməlidir?”– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: “Nə köynək, nə əmmamə, nə şalvar, nə burnus[2], nə də sarı ağaca və ya zəfərana boyanmış paltar geyinməməlidir. Səndəl tapmadığı təqdirdə isə dəri ayaqqabıları topuqdan aşağıya qədər kəsib geysin.” (əl-Buxari, 134)

---

[1] İhrama girmək – həcc və ya ümrə ziyarətini niyyət etmək.

[2] Burnus – dal tərəfdən yaxalığına başlıq bənd edilmiş üst paltarıdır.

# ٤ – كِتَابُ الوُضُوءِ

# 4 – Dəstəmaz kitabı

## ١– باب: لا تُقْبَلُ صَلاةٌ بِغَيْرِ طَهُورٍ

## 1-ci fəsil. Dəstəmazsız namaz qəbul olunmaz

١١٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لاَ تُقْبَلُ صَلاَةُ مَنْ أَحْدَثَ حَتَّى يَتَوَضَّأَ». قَالَ رَجُلٌ مِنْ حَضْرَمَوْتَ مَا الْحَدَثُ يَا أَبَا هُرَيْرَةَ قَالَ فُسَاءٌ أَوْ ضُرَاطٌ. [رواه البخاري: ١٣٥]

**110.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə demişdir: “Sizdən biriniz napak olduqda dəstəmaz almayınca, Allah onun namazını qəbul etməz!” Hədrəmövtdən olan bir kişi dedi: “Napak olmaq nədir, ey Əbu Hureyra?” Əbu Hureyra dedi: “Səsli və ya səssiz yel çıxartmaqdır.” (əl-Buxari, 135)

## ٢– باب: فَضْلُ الوُضُوءِ

## 2-ci fəsil. Dəstəmazın fəziləti

١١١ – عَنْهُ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «إِنَّ أُمَّتِى يُدْعَوْنَ يَوْمَ الْقِيَامَةِ غُرًّا مُحَجَّلِينَ مِنْ آثَارِ الْوُضُوءِ، فَمَنِ اسْتَطَاعَ مِنْكُمْ أَنْ يُطِيلَ غُرَّتَهُ فَلْيَفْعَلْ». [رواه البخاري: ١٣٦]

**111.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ümmətim Qiyamət günü üzləri parlaq, əlləri və ayaqları nurlu olduğu halda gələcəklər.” (Əbu Hureyra dedi:) “Aranızdan kim üzünün parlaqlığını artıra bilirsə, qoy artırsın!” (əl-Buxari, 136)

## ٣– باب: لاَ يَتَوَضَّأُ مِنَ الشَّكِّ حَتَّى يَسْتَيْقِنَ

## 3-cü fəsil. (Dəstəmazın pozulduğunu) yəqinləşdirməyincə, şübhədən dolayı dəstəmaz almamalı

١١٢ – عَنْ عَبْدِ اللهِ بْنِ زَيْدٍ الأَنْصَرِيِّ ﷺ، أَنَّهُ شَكَا إِلَى رَسُولِ اللَّهِ ﷺ الرَّجُلُ الَّذِى يُخَيَّلُ إِلَيْهِ أَنَّهُ يَجِدُ الشَّىْءَ فِى الصَّلاَةِ. فَقَالَ: «لاَ يَنْفَتِلْ – أَوْ لاَ يَنْصَرِفْ – حَتَّى يَسْمَعَ صَوْتًا أَوْ يَجِدَ رِيحًا». [رواه البخاري: ١٣٧]

**112.** Abdullah ibn Zeyd əl-Ənsari ﷺ rəvayət edir ki, bir nəfər namaz əsnasında özündən sanki yel çıxdığını hiss etdiyini Peyğəmbərə ﷺ xəbər verdikdə Peyğəmbər ﷺ buyurdu: “Bir səs eşitməyincə və ya bir iy duymayınca namazdan çıxmasın!” (əl-Buxari, 137)

## ٤– باب: التَّخْفِيفُ فِى الْوُضُوءِ

## 4-cü fəsil. Dəstəmazı yüngül almaq

١١٣ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ نَامَ حَتَّى نَفَخَ ثُمَّ صَلَّى – وَرُبَّمَا قَالَ اضْطَجَعَ حَتَّى نَفَخَ – ثُمَّ قَامَ فَصَلَّى. [رواه البخاري: ١٣٨]

**113.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (uzanıb) yatdı, hətta xorultusu belə eşidildi. Sonra qalxıb (dəstəmaz almadan) namaz qıldı. (əl-Buxari, 138)

## 5-ci fəsil. Dəstəmazı kamil şəkildə almaq

## ٥– باب: إِسْبَاغُ الْوُضُوءِ

١١٤ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ﷺ أَنَّهُ دَفَعَ رَسُولُ اللَّهِ ﷺ مِنْ عَرَفَةَ حَتَّى إِذَا كَانَ بِالشِّعْبِ نَزَلَ فَبَالَ، ثُمَّ تَوَضَّأَ وَلَمْ يُسْبِغِ الْوُضُوءَ. فَقُلْتُ الصَّلاَةَ يَا رَسُولَ اللَّه. فَقَالَ: «الصَّلاَةُ أَمَامَكَ». فَرَكِبَ، فَلَمَّا جَاءَ الْمُزْدَلِفَةَ نَزَلَ فَتَوَضَّأَ، فَأَسْبَغَ الْوُضُوءَ، ثُمَّ أُقِيمَتِ الصَّلاَةُ فَصَلَّى الْمَغْرِبَ، ثُمَّ أَنَاخَ كُلُّ إِنْسَانٍ بَعِيرَهُ فِي مَنْزِلِهِ، ثُمَّ أُقِيمَتِ الْعِشَاءُ فَصَلَّى وَلَمْ يُصَلِّ بَيْنَهُمَا. [رواه البخاري: ١٣٩]

**114.** Usamə ibn Zeyd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Ərəfatdan (Müzdəlifəyə[1]) döndü. Nəhayət, gəlib dağ yoluna çatdıqda (minikdən) yerə düşüb subaşına çıxdı. Sonra dəstəmaz aldı, lakin onu xəfif etdi. Mən dedim: "Namaz (qılacaqsanmı), ya Rəsulullah?" Peyğəmbər ﷺ: "Namaz sənin önündədir[2]"– deyib (dəvəsinə) mindi. (Peyğəmbər ﷺ) Müzdəlifəyə gəlib çatdıqda dəvəsindən yerə düşüb kamil şəkildə dəstəmaz aldı. Sonra namaz qılmaq üçün iqamə verildi və o, məğrib namazını qıldırdı. Sonra hər kəs öz dəvəsini dayandığı yerdə dizi üstə çökdürdü. Sonra işa namazının iqaməsi verildi və o, (camaata) namaz qıldırdı. (Peyğəmbər ﷺ) bu iki namaz arasında heç bir namaz qılmadı. (əl-Buxari, 139)

## 6-cı fəsil. Bir ovuc su götürüb iki əllə üzü yumaq

## ٦– باب: غَسْلُ الْوَجْهِ بِالْيَدَيْنِ مِنْ غَرْفَةٍ وَاحِدَةٍ

١١٥ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّهُ تَوَضَّأَ فَغَسَلَ وَجْهَهُ، ثُمَّ أَخَذَ غَرْفَةً مِنْ مَاءٍ، فَمَضْمَضَ بِهَا وَاسْتَنْشَقَ، ثُمَّ أَخَذَ غَرْفَةً مِنْ مَاءٍ، فَجَعَلَ بِهَا هَكَذَا، أَضَافَهَا إِلَى يَدِهِ الأُخْرَى، فَغَسَلَ بِهِمَا وَجْهَهُ، ثُمَّ أَخَذَ غَرْفَةً مِنْ مَاءٍ، فَغَسَلَ بِهَا يَدَهُ الْيُمْنَى، ثُمَّ أَخَذَ غَرْفَةً مِنْ مَاءٍ، فَغَسَلَ بِهَا يَدَهُ الْيُسْرَى، ثُمَّ مَسَحَ بِرَأْسِهِ، ثُمَّ أَخَذَ غَرْفَةً مِنْ مَاءٍ فَرَشَّ عَلَى رِجْلِهِ الْيُمْنَى حَتَّى غَسَلَهَا، ثُمَّ أَخَذَ غَرْفَةً أُخْرَى، فَغَسَلَ بِهَا رِجْلَهُ – يَعْنِي الْيُسْرَى – ثُمَّ قَالَ هَكَذَا رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَتَوَضَّأُ. [رواه البخاري: ١٤٠]

**115.** İbn Abbasdan ﷺ rəvayət olunur ki, o, dəstəmaz alıb (aşağıdakı qaydada) üzünü yudu; (əvvəlcə) bir ovuc su götürüb ağzını yaxaladı və burnuna su alıb (onun içini) yudu; sonra bir ovuc suyu iki əlinə alıb üzünü yudu; sonra bir ovuc su götürüb sağ qolunu yudu; sonra bir ovuc su götürüb sol qolunu yudu; sonra (yaş əlləri ilə) başına məsh çəkdi; sonra bir ovuc su götürüb sağ ayağına töküb onu yudu; sonra yenə bir ovuc su götürüb sol ayağını yudu, sonra dedi: "Mən Peyğəmbərin ﷺ belə dəstəmaz aldığını gördüm." (əl-Buxari, 140)

---

[1] Ərəfat və Mina arasında yerləşən vadi. Zəvvarlar zülhiccə ayının onuncu gecəsini orada gecələyirlər.

[2] Yəni, namazı Müzdəlifə vadisində qılacağıq.

## 7-ci fəsil. Ayaqyoluna girərkən nə söyləməli

## ٧– باب: مَا يَقُولُ عِنْدَ الْخَلاَءِ

١١٦ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا دَخَلَ الْخَلاَءَ قَالَ: «اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنَ الْخُبُثِ وَالْخَبَائِثِ». [رواه البخاري: ١٤٢]

**116.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna girərkən belə deyərdi: "Allahım, pislikdən və pis əməllərdən (erkək və dişi cinlərdən[1]) Sənə sığınıram!"[2] (əl-Buxari, 142)

## 8-ci fəsil. Ayaqyoluna su qoymaq

## ٨– باب: وَضْعُ الْمَاءِ عِنْدَ الْخَلاَءِ

١١٧ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ دَخَلَ الْخَلاَءَ، فَوَضَعْتُ لَهُ وَضُوءًا قَالَ: «مَنْ وَضَعَ هَذَا». فَأُخْبِرَ فَقَالَ: «اللَّهُمَّ فَقِّهْهُ فِى الدِّينِ». [رواه البخاري: ١٤٣]

**117.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna girdi və mən onun üçün su qoydum. (Ayaqyolundan çıxdıqdan sonra) Peyğəmbər ﷺ: "Bunu kim qoydu?"– deyə soruşdu. Ona (bu haqda) xəbər verildikdə dedi: "Allahım, dini başa düşməyi ona müyəssər et!" (əl-Buxari, 143)

## 9-cu fəsil. Təbii ehtiyacları rəf edərkən qibləyə üz tutmamaq

## ٩– باب: لاَ تُسْتَقْبَلُ الْقِبْلَةُ بِغَائِطٍ أَوْ بَوْلٍ

١١٨ – عَنْ أَبِى أَيُّوبَ الأَنْصَارِىِّ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ «إِذَا أَتَى أَحَدُكُمُ الْغَائِطَ فَلاَ يَسْتَقْبِلِ الْقِبْلَةَ وَلاَ يُوَلِّهَا ظَهْرَهُ، شَرِّقُوا أَوْ غَرِّبُوا». [رواه البخاري: ١٤٤]

**118.** Əbu Əyyub əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizlərdən biri təbii ehtiyacını rəf edərkən üzünü və ya arxasını qibləyə çevirməsin. Üzünüzü şərqə və ya qərbə tərəf çevirin[3]." (əl-Buxari, 144)

---

[1] Cinlər – Uca Allahın oddan yaratdığı məxluqlar. İnsanlar kimi cinlər də yer üzündə sakin olmuş və indi də mövcuddurlar. Onlardan da müsəlman və ya kafir olanı vardır. Sonuncuları şeytan və ya iblis adlandırırlar. İnsanlar bəzən onları görə bilir. Allahın qadağan etdiyinə baxmayaraq, cadugərlər və baxıcılar onlarla əlaqəyə girirlər.

[2] Transkripsiyası: Allahummə inni əuzu bikə minəl-xubsi vəl-xəbais.

[3] "Bu yalnız Mədinə əhalisinə və onun səmtində yerləşən məmləkətlərin əhalisinə aiddir. Şərqdə və qərbdə yaşayanlara isə bunun heç bir aidiyyəti yoxdur. Çünki şərqdə yaşayanların qibləsi qərbdə, qərbdə yaşayanların qibləsi isə şərqdədir." (Belə olduğu təqdirdə, onlar üzlərini cənub və ya şimal istiqamətinə çevirməlidirlər). "Fəthul-Bari", 2/109.

## ١٠– باب: مَنْ تَبَرَّزَ عَلَى لَبِنَتَيْنِ

## 10-cu fəsil. İki kərpicin üstündə oturub təbii ehtiyacları rəf etmək

١١٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ كَانَ يَقُولُ إِنَّ نَاسًا يَقُولُونَ إِذَا قَعَدْتَ عَلَى حَاجَتِكَ، فَلاَ تَسْتَقْبِلِ الْقِبْلَةَ وَلاَ بَيْتَ الْمَقْدِسِ، لَقَدِ ارْتَقَيْتُ يَوْمًا عَلَى ظَهْرِ بَيْتٍ لَنَا، فَرَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ عَلَى لَبِنَتَيْنِ مُسْتَقْبِلاً بَيْتَ الْمَقْدِسِ لِحَاجَتِهِ. [رواه البخاري: ١٤٥]

**119.** Abdullah ibn Ömər رضي الله عنهما dedi: "Bəzi adamlar: "Təbii ehtiyacınızı rəf etmək üçün oturduğunuz zaman üzünüzü qibləyə və ya Beytül-Məqdisə tərəf çevirməyin"– deyirlər. Mən (isə yalnız onu deyə bilərəm ki,) bir gün evimizin damının üstünə çıxmışdım. Bu vaxt mən Peyğəmbəri ﷺ üzünü Beytül-Məqdisə tərəf tutaraq, iki kərpic üstündə oturub təbii ehtiyacını rəf etdiyini gördüm." (əl-Buxari, 145)

## ١١– باب: خُرُوجُ النِّسَاءِ إِلَى الْبَرَازِ

## 11-ci fəsil. Qadınların subaşına çıxması

١٢٠ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ أَزْوَاجَ النَّبِيِّ ﷺ كُنَّ يَخْرُجْنَ بِاللَّيْلِ إِذَا تَبَرَّزْنَ إِلَى الْمَنَاصِعِ – وَهُوَ صَعِيدٌ أَفْيَحُ – فَكَانَ عُمَرُ يَقُولُ لِلنَّبِيِّ ﷺ احْجُبْ نِسَاءَكَ. فَلَمْ يَكُنْ رَسُولُ اللَّهِ ﷺ يَفْعَلُ، فَخَرَجَتْ سَوْدَةُ بِنْتُ زَمْعَةَ زَوْجُ النَّبِيِّ ﷺ لَيْلَةً مِنَ اللَّيَالِي عِشَاءً، وَكَانَتِ امْرَأَةً طَوِيلَةً ، فَنَادَاهَا عُمَرُ أَلاَ قَدْ عَرَفْنَاكِ يَا سَوْدَةُ. حِرْصًا عَلَى أَنْ يَنْزِلَ الْحِجَابُ، فَأَنْزَلَ اللَّهُ آيَةَ الْحِجَابِ. [رواه البخاري: ١٤٦]

**120.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbərin ﷺ zövcələri gecə vaxtı əl-Mənasiyə – böyük bir sahəyə subaşına çıxardılar. (O vaxt) Ömər رضي الله عنه Peyğəmbərə ﷺ: "Zövcələrinə hicab örtməyi əmr et!"– deyərdi. Lakin Peyğəmbər ﷺ (onlara bunu əmr) etməzdi. Nəhayət, gecələrin birində, işa namazı vaxtı Peyğəmbərin ﷺ Səudə bint Zəma adlı zövcəsi bayıra çıxdı. O, ucaboylu bir qadın idi. Ömər hicab ayəsinin nazil olmasını çox arzulayırdı deyə, onu uca səslə çağırıb dedi: "Ey Səudə! Biz səni tanıdıq!" Odur ki, Uca Allah hicab ayəsini nazil etdi. (əl-Buxari, 146)

## ١٢– باب: الاِسْتِنْجَاءِ بِالْمَاءِ

## 12-ci fəsil. (Ayaqyolunda) su ilə yuyunmaq

١٢١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا خَرَجَ لِحَاجَتِهِ أَجِيءُ أَنَا وَغُلاَمٌ مَعَنَا إِدَاوَةٌ مِنْ مَاءٍ. [رواه البخاري: ١٥٠]

**121.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna getdikdə mən və mənim kimi bir uşaq ona bir cürdək su aparardıq." (əl-Buxari, 150)

## ١٣– باب: حَمْلُ الْعَنَزَةِ مَعَ الْمَاءِ فِي الاِسْتِنْجَاءِ

## 13-cü fəsil. (Ayaqyolunda) təmizlənmək üçün su və ağac parçası götürmək

١٢٢ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ كَانَ رَسُولُ اللَّهِ ﷺ يَدْخُلُ الْخَلاَءَ، فَأَحْمِلُ أَنَا وَغُلاَمٌ إِدَاوَةً مِنْ مَاءٍ، وَعَنَزَةً، يَسْتَنْجِي بِالْمَاءِ. [رواه البخاري: ١٥٢]

**122.** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna getdikdə mən və mənim kimi bir uşaq ona bir cürdək su və ağac parçası aparardıq. O, su ilə təmizlənərdi." (əl-Buxari, 152)

## ١٤– باب: النَّهْىُ عَنْ الاِسْتِنْجَاءِ بِالْيَمِينِ

## 14-cü fəsil. (Ayaqyolunda) sağ əl ilə təmizlənməyin qadağan olunması

**١٢٣** – عَنْ أَبِى قَتَادَةَ ﵁ قَالَ، قَالَ رَسُولُ اللَّهِ ﷺ «إِذَا شَرِبَ أَحَدُكُمْ فَلاَ يَتَنَفَّسْ فِى الإِنَاءِ، وَإِذَا أَتَى الْخَلاَءَ فَلاَ يَمَسَّ ذَكَرَهُ بِيَمِينِهِ، وَلاَ يَتَمَسَّحْ بِيَمِينِهِ». [رواه البخاري: ١٥٣]

**123.** Əbu Qətadə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz (bir şey) içdikdə qabın içinə üfürməsin, subaşına çıxdıqda sağ əli ilə cinsiyyət üzvünə toxunmasın və (onu) sağ əli ilə təmizləməsin." (əl-Buxari, 153)

## ١٥– باب: الاِسْتِنْجَاءُ بِالْحِجَارَةِ

## 15-ci fəsil. (Ayaqyolunda) daşla təmizlənmək

**١٢٤** – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ قَالَ اتَّبَعْتُ النَّبِىَّ ﷺ وَخَرَجَ لِحَاجَتِه، فَكَانَ لاَ يَلْتَفِتُ فَدَنَوْتُ مِنْهُ فَقَالَ: «ابْغِنِى أَحْجَارًا أَسْتَنْفِضْ بِهَا – أَوْ نَحْوَهُ – وَلاَ تَأْتِنِى بِعَظْمٍ وَلاَ رَوْثٍ». فَأَتَيْتُهُ بِأَحْجَارٍ بِطَرَفِ ثِيَابِى فَوَضَعْتُهَا إِلَى جَنْبِهِ وَأَعْرَضْتُ عَنْهُ ، فَلَمَّا قَضَى أَتْبَعَهُ بِهِنَّ. [رواه البخاري: ١٥٥]

**124.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etmək üçün bayıra çıxdıqda mən onun ardınca getdim. O dönüb arxaya baxmırdı. Mən ona yaxınlaşdıqda o dedi: "Mənə təmizlənmək üçün bir neçə daş gətir. Nəbadə sümük və ya təzək gətirəsən." Mən paltarımın ətəyində bir neçə daş gətirib onun yanına qoydum və kənara çəkildim. O, ehtiyacını rəf etdikdən sonra daşlarla təmizləndi. (əl-Buxari, 155)

## ١٦– باب: لاَ يُسْتَنْجَى بِرَوْثٍ

## 16-cı fəsil. (Ayaqyolunda) təzəklə təmizlənməmək

**١٢٥** – عَنْ عَبْدَ اللَّه بْنِ مَسْعُود ﵁ قَالَ أَتَى النَّبِىُّ ﷺ الْغَائِطَ، فَأَمَرَنِى أَنْ آتِيَهُ بِثَلاَثَة أَحْجَار، فَوَجَدْتُ حَجَرَيْنِ، وَالْتَمَسْتُ الثَّالِثَ فَلَمْ أَجِدْهُ، فَأَخَذْتُ رَوْثَةً ، فَأَتَيْتُهُ بِهَا، فَأَخَذَ الْحَجَرَيْنِ وَأَلْقَى الرَّوْثَةَ وَقَالَ: «هَذَا رِكْسٌ».
[رواه البخاري: ١٥٦]

**125.** Abdullah ibn Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna getdikdə mənə üç daş gətirməyi əmr etdi. Mən iki daş tapdım, üçüncüsünü də axtardım, lakin tapa bilmədim. *Daşın əvəzinə* bir təzək götürüb ona gətirdim. O, daşları götürdü, təzəyi isə atdı və: "Bu murdardır"– dedi. (əl-Buxari, 156)

## ١٧– باب: الْوُضُوءُ مَرَّةً مَرَّةً

## 17-ci fəsil. Dəstəmaz əzalarını bir dəfə-bir dəfə yumaq

١٢٦ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ، تَوَضَّأَ النَّبِيُّ ﷺ مَرَّةً مَرَّةً. [رواه البخاري: ١٥٧]

**126.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ (əzalarını) bir dəfə-bir dəfə yuyaraq dəstəmaz aldı. (əl-Buxari, 157)

## ١٨– باب: الْوُضُوءُ مَرَّتَيْنِ مَرَّتَيْنِ

## 18-ci fəsil. Dəstəmaz əzalarını iki dəfə-iki dəfə yumaq

١٢٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ زَيْدٍ رضي الله عنه أَنَّ النَّبِيَّ ﷺ تَوَضَّأَ مَرَّتَيْنِ مَرَّتَيْنِ. [رواه البخاري: ١٥٨]

**127.** Abdullah ibn Zeyd رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ (əzalarını) iki dəfə-iki dəfə yuyaraq dəstəmaz aldı. (əl-Buxari, 158)

## ١٩– باب: الْوُضُوءُ ثَلاَثًا ثَلاَثًا

## 19-cu fəsil. Dəstəmaz əzalarını üç dəfə-üç dəfə yumaq

١٢٨ – عَنْ عُثْمَانَ بْنَ عَفَّانَ رضي الله عنه، أَنَّهُ دَعَا بِإِنَاءٍ، فَأَفْرَغَ عَلَى كَفَّيْهِ ثَلاَثَ مِرَارٍ فَغَسَلَهُمَا، ثُمَّ أَدْخَلَ يَمِينَهُ فِي الإِنَاءِ فَمَضْمَضَ، وَاسْتَنْشَقَ، ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلاَثًا، وَيَدَيْهِ إِلَى الْمِرْفَقَيْنِ ثَلاَثَ مِرَارٍ، ثُمَّ مَسَحَ بِرَأْسِهِ، ثُمَّ غَسَلَ رِجْلَيْهِ ثَلاَثَ مِرَارٍ إِلَى الْكَعْبَيْنِ، ثُمَّ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ «مَنْ تَوَضَّأَ نَحْوَ وُضُوئِي هَذَا، ثُمَّ صَلَّى رَكْعَتَيْنِ، لاَ يُحَدِّثُ فِيهِمَا نَفْسَهُ، غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ». [رواه البخاري: ١٥٩]

**128.** Osman ibn Əffan رضي الله عنه su gətizdirib (dəstəmaz aldı), əllərinə su töküb onları üç dəfə yudu; sonra sağ əlini qaba salıb *su götürdü və bununla* həm ağzını yaxaladı, həm də burnunun içini yudu; sonra üç dəfə üzünü və üç dəfə qollarını dirsəklərə qədər yudu; sonra başına məsh çəkdi; sonra üç dəfə ayaqlarını topuqlara qədər yudu, sonra da dedi: “Peyğəmbər ﷺ demişdir: “Mənim kimi dəstəmaz alıb, qəlbindən heç bir şey keçirtmədən iki rükət namaz qılan kimsənin keçmiş günahları bağışlanar.” (əl-Buxari, 159)

١٢٩ – وَ فِي رِوَايَةٍ: أَنَّ عُثْمَانَ رضي الله عنه قَالَ: أَلاَ أُحَدِّثُكُمْ حَدِيثًا لَوْلاَ آيَةٌ مَا حَدَّثْتُكُمُوهُ، سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «لاَ يَتَوَضَّأُ رَجُلٌ فَيُحْسِنُ وُضُوءَهُ، وَيُصَلِّي الصَّلاَةَ إِلاَّ غُفِرَ لَهُ مَا بَيْنَهُ وَبَيْنَ الصَّلاَةِ حَتَّى يُصَلِّيَهَا».
قَالَ عُرْوَةُ الآيَةُ ﴿إِنَّ ٱلَّذِينَ يَكْتُمُونَ مَآ أَنزَلْنَا مِنَ ٱلْبَيِّنَٰتِ﴾ [رواه البخاري: ١٦٠]

**129.** Başqa bir rəvayətdə Osman ibn Əffan رضي الله عنه demişdir: “Sizə elə bir hədis danışacağam ki, əgər (Allahın Kitabındakı) ayə olmasaydı, onu sizə danışmazdım. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Gözəl tərzdə dəstəmaz alıb, namaz qılan elə bir kimsə yoxdur ki, dəstəmaz ilə qılacağı namaz arasındakı (vaxt əsnasında olan) günahları bağışlanmasın.” (əl-Buxari, 160)

Urva deyir ki, (Osmanın رضي الله عنه) qəsd etdiyi ayə budur: “Kitabda insanlara bəyan etdiyimiz açıq-aydın dəlilləri və doğru yol göstərən ayələri nazil etdikdən

sonra onları gizli saxlayanlara həm Allah lənət edir, həm də lənət edə bilənlər lənət oxuyurlar!”[1]

## 20-ci fəsil. Dəstəmaz aldıqda buruna su alıb çıxarmaq

## ٢٠– باب: الاِسْتِنْثَارُ فِى الْوُضُوءِ

١٣٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ: «مَنْ تَوَضَّأَ فَلْيَسْتَنْثِرْ، وَمَنِ اسْتَجْمَرَ فَلْيُوتِرْ». [رواه البخاري: ١٦١]

**130.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “Qoy dəstəmaz alan kəs burnuna su alıb (içini) yusun; (ayaqyolunda) daşla təmizlənən kəs tək sayda (daşla silinsin).” (əl-Buxari, 161)

## 21-ci fəsil. (Ayaqyolunda) daşla təmizləndikdə bunu tək sayda etmək

## ٢١– باب: الاِسْتِجْمَارُ وِتْرًا

١٣١ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ، أَنَّ رَسُولَ اللَّه ﷺ قَالَ: «إِذَا تَوَضَّأَ أَحَدُكُمْ فَلْيَجْعَلْ فِى أَنْفه ثُمَّ لِيَنْثُرْ، وَمَنِ اسْتَجْمَرَ فَلْيُوترْ، وَإِذَا اسْتَيْقَظَ أَحَدُكُم منْ نَوْمِهِ فَلْيَغْسِلْ يَدَهُ قَبْلَ أَنْ يُدْخِلَهَا فِى وَضُوئِهِ، فَإِنَّ أَحَدَكُمْ لاَ يَدْرِى أَيْنَ بَاتَتْ يَدُهُ». [رواه البخاري: ١٦٢]

**131.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Sizdən biriniz dəstəmaz aldığı zaman burnuna su alıb çıxarsın. Qoy daşla təmizlənən kəs tək sayda (daşla silinsin). Sizdən biriniz yuxudan oyandıqda əlini dəstəmaz alacağı qabın içinə salmazdan əvvəl onu üç dəfə yusun. Çünki o, (yuxuda ikən) əlinin haralara dəydiyini bilmir.” (əl-Buxari, 162)

## 22-ci fəsil. Nəleyinə[2] məsh çəkməmək, onları çıxarıb ayaqları yumaq

## ٢٢– باب: غَسْلُ الرِّجْلَيْنِ فِى النَّعْلَيْنِ وَلاَ يَمْسَحُ عَلَى النَّعْلَيْنِ

١٣٢ – عَنْ عَبْد اللَّه بْنِ عُمَرَ ﷺ – وَ قَدْ قيلَ لَهُ –: رَأَيْتُكَ لاَ تَمَسُّ منَ الأَرْكَان إِلاَّ الْيَمَانِيَيْنِ، وَرَأَيْتُكَ تَلْبَسُ النِّعَالَ السِّبْتِيَّةَ، وَرَأَيْتُكَ تَصْبُغُ بالصُّفْرَة، وَرَأَيْتُكَ إِذَا كُنْتَ بمَكَّةَ أَهَلَّ النَّاسُ إِذَا رَأَوُا الْهِلاَلَ وَلَمْ تُهِلَّ أَنْتَ حَتَّى كَانَ يَوْمُ التَّرْوِيَة. قَالَ عَبْدُ اللَّه أَمَّا الأَرْكَانُ فَإِنِّى لَمْ أَرَ رَسُولَ اللَّه ﷺ يَمَسُّ إِلاَّ الْيَمَانِيَيْنِ، وَأَمَّا النِّعَالُ السِّبْتِيَّةُ فَإِنِّى رَأَيْتُ رَسُولَ اللَّه ﷺ يَلْبَسُ النَّعْلَ الَّتِى لَيْسَ فيهَا شَعَرٌ وَيَتَوَضَّأُ فيهَا، فَأَنَا أُحبُّ أَنْ أَلْبَسَهَا، وَأَمَّا الصُّفْرَةُ فَإِنِّى رَأَيْتُ رَسُولَ اللَّه ﷺ يَصْبُغُ بهَا ، فَأَنَا أُحبُّ أَنْ أَصْبُغَ بِهَا، وَأَمَّا الإِهْلاَلُ فَإِنِّى لَمْ أَرَ رَسُولَ اللَّهِ ﷺ يُهلُّ حَتَّى تَنْبَعِثَ بِهِ رَاحِلَتُهُ. [رواه البخاري: ١٦٦]

**132.** Bir nəfər Abdullah ibn Ömərə ﷺ belə dedi: “Mən gördüm ki, sən Kəbənin yalnız iki yəmən küncünə (– qara daşa və ondan solda yerləşən küncə) toxu-

[1] “əl-Bəqərə” surəsi, 159.

[2] Səndəl.

nursan. Həmçinin, gördüm ki, sən aşılanmış dəridən tikilmiş səndəl geyirsən. Habelə, gördüm ki, sən (libasını) sarı rəngə boyayırsan. Həm də gördüm ki, sən Məkkədə olduqda camaat təzə ayın (zülhiccə ayının) doğduğunu gördükdə təlbiyə[1] deməyə başlayır, sən isə tərviyə günü[2] girmədikcə təlbiyə demirsən."

Abdullah ibn Ömər ﷺ dedi: "Mən Peyğəmbərin ﷺ qara daş və yəmən küncündən başqa (Kəbənin digər künclərinə) toxunduğunu görmədim. Aşılanmış dəridən tikilmiş səndələ gəlincə, mən Peyğəmbərin ﷺ, (aşılandıqdan sonra) üzərində tük qalmamış dəridən tikilmiş səndəl geydiyini və onları ayağından çıxartmadan dəstəmaz aldığını gördüm. Elə buna görə mən də səndəl geyməyi xoşlayıram. Sarı rəngə gəlincə, mən Peyğəmbərin ﷺ (libasını) sarı rəngə boyadığını gördüm. Elə buna görə mən də bu boyadan istifadə etməyi xoşlayıram. Təlbiyəyə gəldikdə isə, mən Peyğəmbərin ﷺ dəvəsi ayağa qalxıb hərəkət etməyincə təlbiyə dediyini görmədim." (əl-Buxari, 166)

## 23-cü fəsil. Dəstəmaz və qüsl aldıqda sağ tərəfdən başlamaq

## ٢٣– باب: التَّيَمُّنُ فِى الْوُضُوءِ وَالْغُسْلِ

١٣٣ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كَانَ النَّبِىُّ ﷺ يُعْجِبُهُ التَّيَمُّنُ فِى تَنَعُّلِهِ وَتَرَجُّلِهِ وَطُهُورِهِ وَفِى شَأْنِهِ كُلِّهِ. [رواه البخاري: ١٦٨]

**133.** Aişə رضي الله عنها rəvayət edir ki, "Peyğəmbər ﷺ ayaqqabılarını geyindikdə, saçını daradıqda, yuyunduqda və bütün işlərində sağdan başlamağı sevərdi." (əl-Buxari, 168)

## 24-cü fəsil. Namaz vaxtı yaxınlaşdıqda dəstəmaz almaq üçün su axtarmaq

## ٢٤– باب: الْتِمَاسُ الْوَضُوءِ إِذَا حَانَتِ الصَّلاَةُ

١٣٤ – عَنْ أَنَسِ بْنِ مَالِك رضي الله عنه، أَنَّهُ قَالَ رَأَيْتُ رَسُولَ اللَّه ﷺ وَحَانَتْ صَلاَةُ الْعَصْرِ، فَالْتَمَسَ النَّاسُ الْوَضُوءَ فَلَمْ يَجِدُوهُ، فَأُتِىَ رَسُولُ اللَّه ﷺ بِوَضُوءٍ، فَوَضَعَ رَسُولُ اللَّه ﷺ فِى ذَلِكَ الإِنَاءِ يَدَهُ، وَأَمَرَ النَّاسَ أَنْ يَتَوَضَّئُوا مِنْهُ. قَالَ فَرَأَيْتُ الْمَاءَ يَنْبُعُ مِنْ تَحْتِ أَصَابِعِهِ حَتَّى تَوَضَّئُوا مِنْ عِنْدِ آخِرِهِمْ. [رواه البخاري: ١٦٩]

**134.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, mən Peyğəmbərin ﷺ yanında idim. Əsr namazının vaxtı yaxınlaşmışdı. Camaat dəstəmaz almaq üçün su axtarmağa başladı, lakin tapa bilmədi. Sonra Peyğəmbərə ﷺ dəstəmaz almaq üçün (bir qab) su gətirdilər. Peyğəmbər ﷺ əlini o qabın içinə saldı və camaata ondan dəstəmaz almağı əmr etdi. Mən, camaat dəstəmaz alıb qurtaranadək Peyğəmbərin ﷺ barmaqlarının uclarından su qaynayıb axdığını gördüm. (əl-Buxari, 169)

---

[1] Təlbiyə həcc mərasimində uca səslə təkrar-təkrar deyilən duadır. Bu dua ərəbcə belə deyilir:

(( لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ، لَبَّيْكَ لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ، إِنَّ الْحَمْدَ، وَالنِّعْمَةَ، لَكَ وَ الْمُلْكَ، لاَ شَرِيكَ لَكَ ))

Transkripsiyası: [Ləbbeykə-llahummə ləbbeyk, ləbbeykə lə şəriykə ləkə ləbbeyk, innəl-həmdə vən-ni'mətə, ləkə vəl-mulkə, lə şəriykə lək]

Tərcüməsi: «Hüzurundayam, Allahım, hüzurundayam! Hüzurundayam, Sənin şərikin yoxdur, hüzurundayam! Həmd Sənədir, nemət və mülk Sənə məxsusdur, Sənin şərikin yoxdur!»

[2] Tərviyə – zülhiccə ayının səkkizinci günü.

## 25-ci fəsil. İnsan saçlarını yumaq üçün istifadə edilən su

## ٢٥– باب: الْمَاءُ الَّذِى يُغْسَلُ بِهِ شَعَرُ الإِنْسَانِ

١٣٥ – عَنْ أَنَسٍ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ لَمَّا حَلَقَ رَأْسَهُ كَانَ أَبُو طَلْحَةَ أَوَّلَ مَنْ أَخَذَ مِنْ شَعَرِهِ. [رواه البخاري: ١٧١]

**135.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ başını qırxdırdıqda onun saçından ilk götürən kimsə Əbu Təlhə ﷺ olmuşdur. (əl-Buxari, 171)

## 26-cı fəsil. İt sizdən birinizin qabından (su və s.) içmişdirsə...

## ٢٦– باب: إِذَا شَرِبَ الْكَلْبُ فِى إِنَاءِ أَحَدِكُمْ

١٣٦ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ «إِذَا شَرِبَ الْكَلْبُ فِى إِنَاءِ أَحَدِكُمْ فَلْيَغْسِلْهُ سَبْعًا». [رواه البخاري: ١٧٢]

**136.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "İt sizdən birinizin qabından su içsə, qoy o qabı yeddi dəfə yusun." (əl-Buxari, 172)

١٣٧ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ﷺ قَالَ: كَانَتِ الْكِلاَبُ تَبُولُ وَتُقْبِلُ وَتُدْبِرُ فِى الْمَسْجِدِ فِى زَمَانِ رَسُولِ اللَّهِ ﷺ فَلَمْ يَكُونُوا يَرُشُّونَ شَيْئًا مِنْ ذَلِكَ. [رواه البخاري: ١٧٤]

**137.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ dövründə itlər sidik ifraz edər, məscidə girib-çıxardılar, (lakin əshabələr) onların (bədəni və ya sidiyi) dəydiyi yerlərə su səpməzdilər. (əl-Buxari, 174)

## 27-ci fəsil. Dəstəmaz almağı ancaq iki ifrazat çıxışlarından (xaric olan şeylərə görə) vacib görən kimsə

## ٢٧– باب: مَنْ لَمْ يَرَ الْوُضُوءَ إِلاَّ مِنَ الْمَخْرَجَيْنِ

١٣٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ «لاَ يَزَالُ الْعَبْدُ فِى صَلاَةٍ مَا كَانَ فِى الْمَسْجِدِ يَنْتَظِرُ الصَّلاَةَ، مَا لَمْ يُحْدِثْ». [رواه البخاري: ١٧٦]

**138.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir adam, dəstəmazını pozmadan məsciddə namazı gözlədiyi müddət ərzində namazda olduğu kimi sayılır." (əl-Buxari, 176)

١٣٩ – عَنْ زَيْدَ بْنَ خَالِد ﷺ قَالَ: سَأَلْتُ عُثْمَانَ بْنَ عَفَّانَ ﷺ قُلْتُ أَرَأَيْتَ إِذَا جَامَعَ فَلَمْ يُمْنِ قَالَ عُثْمَانُ يَتَوَضَّأُ كَمَا يَتَوَضَّأُ لِلصَّلاَةِ، وَيَغْسِلُ ذَكَرَهُ. قَالَ عُثْمَانُ سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ. فَسَأَلْتُ عَنْ ذَلِكَ عَلِيًّا، وَالزُّبَيْرَ، وَطَلْحَةَ، وَأُبَىَّ بْنَ كَعْبٍ ﷺ كُلُّهُمْ لَفَأَمَرُوهُ بِذَلِكَ. [رواه البخاري: ١٧٩]

**139.** Zeyd ibn Xalid ﷺ rəvayət edir ki, mən Osman ibn Əffandan ﷺ: "Necə bilirsən, cinsi əlaqədə olub məni axıtmayan kəs nə etməlidir?"– deyə soruşdum. Osman: "Namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz almalı və cinsiyyət üzvünü yumalıdır"– deyə cavab verdi, sonra da: "Bunu Peyğəmbərdən ﷺ eşitdim"– deyə əlavə etdi.

(Zeyd ﷺ dedi:) "Mən bu haqda Əlidən, Zubeyrdən, Təlhədən və Ubey ibn Kəbdən ﷺ soruşdum. Hamısı bunu (cinsi əlaqədə olub məni axıtmayan) kimsəyə aid etdi." (əl-Buxari, 179)

١٤٠ – عَنْ أَبِى سَعِيدٍ الْخُدْرِىِّ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَرْسَلَ إِلَى رَجُلٍ مِنَ الأَنْصَارِ فَجَاءَ وَرَأْسُهُ يَقْطُرُ، فَقَالَ النَّبِىُّ ﷺ «لَعَلَّنَا أَعْجَلْنَاكَ». فَقَالَ نَعَمْ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ «إِذَا أُعْجِلْتَ أَوْ قُحِطْتَ، فَعَلَيْكَ الْوُضُوءُ». [رواه البخاري: ١٨٠]

**140.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ənsardan olan bir nəfərə xəbər göndərib yanına çağırtdırdı. O adam gəldikdə (biz onun) başından damcı-damcı su töküldüyünü (gördük). Peyğəmbər ﷺ: "Deyəsən, səni tələsdirdik?"– deyə soruşdu. O: "Bəli!"– deyə cavab verdikdə, Peyğəmbər ﷺ buyurdu: "Səni tələsdirsələr və ya yaxınlıq edib məni axıtmasan, dəstəmaz almaq sənə yetər." (əl-Buxari, 180)

## 28-ci fəsil. Kişinin öz qardaşına dəstəmaz almaqda yardım etməsi

## ٢٨– باب: الرَّجُلُ يُوَضِّئُ صَاحِبَه

١٤١ – عَنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ﷺ أَنَّهُ كَانَ مَعَ رَسُولِ اللَّهِ ﷺ فِى سَفَرٍ، وَأَنَّهُ ذَهَبَ لِحَاجَةٍ لَهُ، وَأَنَّ مُغِيرَةَ جَعَلَ يَصُبُّ الْمَاءَ عَلَيْهِ، وَهُوَ يَتَوَضَّأُ، فَغَسَلَ وَجْهَهُ وَيَدَيْهِ وَمَسَحَ بِرَأْسِهِ وَمَسَحَ عَلَى الْخُفَّيْنِ. [رواه البخاري: ١٨٢]

**141.** Muğira ibn Şobədən ﷺ rəvayət olunur ki, o, Peyğəmbərlə ﷺ birlikdə səfərdə ikən Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etmək üçün subaşına şıxdı. Sonra Muğira onun *əllərinə* su tökdü və o, dəstəmaz aldı – üzünü və qollarını yudu, başına və məstlərinə[1] məsh çəkdi." (əl-Buxari, 182)

## 29-cu fəsil. Dəstəmazsız Quran oxumaq və başqa işlər görmək

## ٢٩– باب: قِرَاءَةُ الْقُرْآنِ بَعْدَ الْحَدَث وَغَيْرِه

١٤٢ – عَنْ عَبْدِ اللَّهِ بْنَ عَبَّاسٍ ﷺ أَخْبَرَهُ أَنَّهُ بَاتَ لَيْلَةً عِنْدَ مَيْمُونَةَ زَوْجِ النَّبِىِّ ﷺ وَهِىَ خَالَتُهُ فَاضْطَجَعْتُ فِى عَرْضِ الْوِسَادَةِ، وَاضْطَجَعَ رَسُولُ اللَّهِ ﷺ وَأَهْلُهُ فِى طُولِهَا، فَنَامَ رَسُولُ اللَّهِ ﷺ حَتَّى إِذَا انْتَصَفَ اللَّيْلُ، أَوْ قَبْلَهُ بِقَلِيلٍ أَوْ بَعْدَهُ بِقَلِيلٍ، اسْتَيْقَظَ رَسُولُ اللَّهِ ﷺ فَجَلَسَ يَمْسَحُ النَّوْمَ عَنْ وَجْهِهِ بِيَدِهِ، ثُمَّ قَرَأَ الْعَشْرَ الآيَاتِ الْخَوَاتِمَ مِنْ سُورَةِ آلِ عِمْرَانَ، ثُمَّ قَامَ إِلَى شَنٍّ مُعَلَّقَةٍ، فَتَوَضَّأَ مِنْهَا فَأَحْسَنَ وُضُوءَهُ، ثُمَّ قَامَ يُصَلِّى. قَالَ ابْنُ عَبَّاسٍ فَقُمْتُ

[1] Məst – dəridən və ya başqa yumşaq materialdan tikilən yüngül ayaqqabı.

فَصَنَعْتُ مِثْلَ مَا صَنَعَ، ثُمَّ ذَهَبْتُ، فَقُمْتُ إِلَى جَنْبِهِ، فَوَضَعَ يَدَهُ الْيُمْنَى عَلَى رَأْسِي، وَأَخَذَ بِأُذُنِي الْيُمْنَى، يَفْتِلُهَا، فَصَلَّى رَكْعَتَيْنِ، ثُمَّ رَكْعَتَيْنِ، ثُمَّ رَكْعَتَيْنِ، ثُمَّ رَكْعَتَيْنِ، ثُمَّ رَكْعَتَيْنِ، ثُمَّ رَكْعَتَيْنِ، ثُمَّ أَوْتَرَ، ثُمَّ اضْطَجَعَ، حَتَّى أَتَاهُ الْمُؤَذِّنُ، فَقَامَ، فَصَلَّى رَكْعَتَيْنِ خَفِيفَتَيْنِ، ثُمَّ خَرَجَ فَصَلَّى الصُّبْحَ. [رواه البخاري: ١٨٣]

**142.** Abdullah ibn Abbas ﵄ rəvayət edir ki, bir gecə o Peyğəmbərin ﷺ zövcəsi, xalası Meymunənin ﵂ evində qaldı.

(İbn Abbas ﵄ deyir ki,) mən yatağın köndələninə uzandım, Peyğəmbər ﷺ və onun zövcəsi isə yatağın uzununa uzandılar. Peyğəmbər ﷺ yatdı. Nəhayət, gecə yarısı yetişdikdə, (və ya bundan bir az əvvəl yaxud bir az sonra yuxudan) oyandı və gözlərini ovxalayıb yuxusunu dağıtdı. Sonra Ali-İmran surəsinin son on ayəsini oxudu. Sonra qalxıb (tavandan) asılmış köhnə cürdəyə yaxınlaşdı və kamil şəkildə dəstəmaz aldı Sonra durub namaz qıldı. Mən də ayağa qalxıb onun etdiyi kimi etdim. Sonra gedib onun yanında durdum. O, sağ əlini mənim başıma qoydu və sağ qulağımdan tutub onu dartdı. Sonra iki rükət, sonra yenə iki rükət, sonra yenə iki rükət, sonra yenə iki rükət, sonra yenə iki rükət, sonra yenə iki rükət, sonra da bir rükət (namaz) qıldı. Sonra yerinə uzandı. Nəhayət, müəzzin onun yanına gəldikdə qalxıb iki rükət xəfifcə namaz qıldı. Sonra gedib sübh namazını qıldırdı. (əl-Buxari, 183)

## 30-cu fəsil. Başın hər tərəfinə məsh çəkmək

## ٣٠– باب: مَسْحُ الرَّأْسِ كُلِّهِ

١٤٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ زَيْدٍ ﵁، أَنَّ رَجُلاً قَالَ لَهُ أَتَسْتَطِيعُ أَنْ تُرِيَنِي كَيْفَ كَانَ رَسُولُ اللَّهِ ﷺ يَتَوَضَّأُ فَقَالَ عَبْدُ اللَّهِ بْنُ زَيْدٍ نَعَمْ. فَدَعَا بِمَاءٍ، فَأَفْرَغَ عَلَى يَدَيْهِ فَغَسَلَ يَدَهُ مَرَّتَيْنِ، ثُمَّ مَضْمَضَ وَاسْتَنْثَرَ ثَلاَثًا، ثُمَّ غَسَلَ وَجْهَهُ ثَلاَثًا، ثُمَّ غَسَلَ يَدَيْهِ مَرَّتَيْنِ مَرَّتَيْنِ إِلَى الْمِرْفَقَيْنِ، ثُمَّ مَسَحَ رَأْسَهُ بِيَدَيْهِ، فَأَقْبَلَ بِهِمَا وَأَدْبَرَ، بَدَأَ بِمُقَدَّمِ رَأْسِهِ، حَتَّى ذَهَبَ بِهِمَا إِلَى قَفَاهُ، ثُمَّ رَدَّهُمَا إِلَى الْمَكَانِ الَّذِي بَدَأَ مِنْهُ، ثُمَّ غَسَلَ رِجْلَيْهِ. [رواه البخاري: ١٨٥]

**143.** Bir nəfər Abdullah ibn Zeydə ﵁ dedi: "Peyğəmbərin ﷺ necə dəstəmaz aldığını mənə göstərə bilərsənmi?" Abdullah ibn Zeyd: "Bəli"– deyib su gətizdirdi. Sonra əllərinə su töküb onu iki dəfə yudu; sonra üç dəfə (su götürüb) həm ağzını yaxaladı, həm də burnunun içini yudu; sonra üç dəfə üzünü yudu. sonra iki dəfə qollarını dirsəklərə qədər yudu; sonra əllərini irəli-geri aparıb gətirməklə başına məsh çəkdi – əllərini başının ön tərəfindən qafasına qədər apardı, sonra da başladığı yerə qaytardı; bundan sonra ayaqlarını yudu. (əl-Buxari, 185)

## 31-ci fəsil. İnsanlar dəstəmaz aldıqdan sonra (onların qabda qalmış) artığından istifadə etmək

## ٣١– باب: اسْتِعْمَالُ فَضْلِ وَضُوءِ النَّاسِ

١٤٤ – عَنْ أَبِي جُحَيْفَةَ ﵁ قَالَ: خَرَجَ عَلَيْنَا رَسُولُ اللَّهِ ﷺ بِالْهَاجِرَةِ، فَأُتِيَ بِوَضُوءٍ فَتَوَضَّأَ، فَجَعَلَ النَّاسُ يَأْخُذُونَ مِنْ فَضْلِ وَضُوئِهِ فَيَتَمَسَّحُونَ بِهِ، فَصَلَّى النَّبِيُّ ﷺ الظُّهْرَ رَكْعَتَيْنِ وَالْعَصْرَ رَكْعَتَيْنِ، وَبَيْنَ يَدَيْهِ عَنَزَةٌ. [رواه البخاري: ١٨٧]

**144.** Əbu Cüheyfə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ günorta bizim yanımıza gəldi. Ona dəstəmaz almaq üçün su gətirdilər və o, dəstəmaz aldı. Sonra insanlar onun dəstəmaz aldığı sudan qalan artığı götürüb (o suyun bərəkətinə nail olmaq məqsədilə) bədənlərinə sürtməyə başladılar. Sonra Peyğəmbər ﷺ önündə yerə sancılmış bir ağac parçası olduğu halda iki rükət zöhr namazını və iki rükət əsr namazını qıldı. (əl-Buxari, 187)

١٤٥ – عَنْ السَّائِبَ بْنَ يَزِيدَ ﷺ قَالَ: ذَهَبَتْ بِى خَالَتِى إِلَى النَّبِىِّ ﷺ فَقَالَتْ يَا رَسُولَ اللَّه، إِنَّ ابْنَ أُخْتِى وَجِعٌ. فَمَسَحَ رَأْسِى وَدَعَا لِى بِالْبَرَكَة، ثُمَّ تَوَضَّأَ فَشَرِبْتُ مِنْ وَضُوئِه، ثُمَّ قُمْتُ خَلْفَ ظَهْرِه، فَنَظَرْتُ إِلَى خَاتَمِ النُّبُوَّة بَيْنَ كَتِفَيْهِ مِثْلِ زِرِّ الْحَجَلَةِ. [رواه البخاري: ١٩٠]

**145.** Saib ibn Yezid ﷺ rəvayət edir ki, xalam məni Peyğəmbərin ﷺ yanına gətirib: "Ya Rəsulullah! Bacım oğlu xəstələnib (ayaqları bərk ağrıyır)"– dedi. Peyğəmbər ﷺ əlini başıma çəkib (Allahdan) mənim üçün bərəkət dilədi. Sonra dəstəmaz aldı. Mən onun dəstəmaz aldığı sudan içdim. Sonra onun arxasında durdum və kürəkləri arasında kəklik yumurtası boyda peyğəmbərlik möhürünü gördüm." (əl-Buxari, 190)

## 32-ci fəsil. Kişinin öz zövcəsi ilə birlikdə dəstəmaz alması

## ٣٢– باب: وُضُوءُ الرَّجُلِ مَعَ امْرَأَتِه

١٤٦ – عَنْ عَنْ عَبْدِ اللَّه بْنِ عُمَرَ ﷺ قَالَ: كَانَ الرِّجَالُ وَالنِّسَاءُ يَتَوَضَّئُونَ فِى زَمَانِ رَسُولِ اللَّهِ ﷺ جَمِيعًا. [رواه البخاري: ١٩٣]

**146.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ zamanında (hicab ayəsi nazil olmamışdan əvvəl) kişilər və qadınlar bir yerdə dəstəmaz alardılar. (əl-Buxari, 193)

## 33-cü fəsil. Peyğəmbərin ﷺ öz dəstəmaz suyunu huşunu itirmiş kimsənin üzünə səpməsi

## ٣٣– باب: صَبُّ النَّبِىِّ ﷺ وَضُوءَهُ عَلَى الْمُغْمَى عَلَيْه

١٤٧ – عَنْ جَابِرٍ ﷺ، قَالَ: جَاءَ رَسُولُ اللَّه ﷺ يَعُودُنِى، وَأَنَا مَرِيضٌ لاَ أَعْقِلُ، فَتَوَضَّأَ وَصَبَّ عَلَىَّ مِنْ وَضُوئِه، فَعَقَلْتُ فَقُلْتُ يَا رَسُولَ اللَّه لِمَنِ الْمِيرَاثُ إِنَّمَا يَرِثُنِى كَلاَلَةٌ. فَنَزَلَتْ آيَةُ الْفَرَائِضِ. [رواه البخاري: ١٢١]

**147.** Cabir ﷺ rəvayət edir ki, mən xəstəlikdən halsızlaşdığım zaman Peyğəmbər ﷺ mənə baş çəkdi. O, dəstəmaz aldı və qabda qalmış sudan mənim üzümə səpdi. Mən özümə gəldikdə: "Mirasım kimə qalacaq, ya Rəsulullah? Mənim varislərim ancaq uzaq qohumlarımdır"– deyə soruşdum və miras ayəsi nazil oldu[1]. (əl-Buxari, 194)

[1] "ən-Nisa" surəsi, 176.

## 34-cü fəsil. Təknədə qüsl və dəstəmaz almaq

## ٣٤– باب: الْغُسْلُ وَالْوُضُوءُ فِى الْمِخْضَبِ

١٤٨ – عَنْ أَنَسٍ ﷺ قَالَ: حَضَرَتِ الصَّلاَةُ، فَقَامَ مَنْ كَانَ قَرِيبَ الدَّارِ إِلَى أَهْلِهِ، وَبَقِىَ قَوْمٌ ، فَأُتِىَ رَسُولُ اللَّهِ ﷺ بِمِخْضَبٍ مِنْ حِجَارَةٍ فِيهِ مَاءٌ، فَصَغُرَ الْمِخْضَبُ أَنْ يَبْسُطَ فِيهِ كَفَّهُ، فَتَوَضَّأَ الْقَوْمُ كُلُّهُمْ. قُلْنَا كَمْ كُنْتُمْ قَالَ ثَمَانِينَ وَزِيَادَةً. [رواه البخاري: ١٩٥]

**148.** Ənəs ﷺ rəvayət edir ki, bir dəfə namazın vaxtı yetişdikdə evləri yaxın olanlar (dəstəmaz almaq üçün) əhli-əyalının yanına getdilər, digərləri isə (orada) qaldılar. (Bu vaxt) Peyğəmbərə ﷺ daş təknədə su gətirdilər. Təknə o qədər balaca idi ki, Peyğəmbər ﷺ əlini onun içinə sala bilmədi. (Buna baxmayaraq) orada olanların hamısı (o su ilə) dəstəmaz aldı.

(Ravilərdən biri deyir ki,) biz Ənəsdən ﷺ: "Siz neçə nəfər idiniz?"– deyə soruşduq. Ənəs ﷺ: "Səksən nəfərdən çox idik"– deyə cavab verdi. (əl-Buxari, 195)

١٤٩ – عَنْ أَبِى مُوسَى ﷺ أَنَّ النَّبِىَّ ﷺ دَعَا بِقَدَحٍ فِيهِ مَاءٌ، فَغَسَلَ يَدَيْهِ وَوَجْهَهُ فِيهِ وَمَجَّ فِيهِ. [رواه البخاري: ١٩٦]

**149.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir çanaq su gətizdirdi. Əllərini və üzünü o qabın içində yuduqdan sonra (ağzındakı suyu) onun içinə püskürtdü. (əl-Buxari, 196)

١٥٠ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: لَمَّا ثَقُلَ النَّبِىُّ ﷺ وَاشْتَدَّ بِهِ وَجَعُهُ، اسْتَأْذَنَ أَزْوَاجَهُ فِى أَنْ يُمَرَّضَ فِى بَيْتِى، فَأَذِنَّ لَهُ ، فَخَرَجَ النَّبِىُّ ﷺ بَيْنَ رَجُلَيْنِ تَخُطُّ رِجْلاَهُ فِى الأَرْضِ بَيْنَ عَبَّاسٍ وَرَجُلٍ آخَرَ. قَالَ عُبَيْدُ اللَّهِ فَأَخْبَرْتُ عَبْدَ اللَّهِ بْنَ عَبَّاسٍ فَقَالَ أَتَدْرِى مَنِ الرَّجُلُ الآخَرُ قُلْتُ لاَ. قَالَ هُوَ عَلِىٌّ. وَكَانَتْ عَائِشَةُ ﷺ تُحَدِّثُ أَنَّ النَّبِىَّ ﷺ قَالَ بَعْدَ مَا دَخَلَ بَيْتَهُ وَاشْتَدَّ وَجَعُهُ: «هَرِيقُوا عَلَىَّ مِنْ سَبْعِ قِرَبٍ، لَمْ تُحْلَلْ أَوْكِيَتُهُنَّ، لَعَلِّى أَعْهَدُ إِلَى النَّاسِ». وَأُجْلِسَ فِى مِخْضَبٍ لِحَفْصَةَ زَوْجِ النَّبِىِّ ﷺ، ثُمَّ طَفِقْنَا نَصُبُّ عَلَيْهِ تِلْكَ حَتَّى طَفِقَ يُشِيرُ إِلَيْنَا أَنْ قَدْ فَعَلْتُنَّ، ثُمَّ خَرَجَ إِلَى النَّاسِ. [رواه البخاري: ١٩٨]

**150.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ xəstəliyi ağırlaşdığı və ağrıları şiddətləndiyi zaman zövcələrindən xahiş etdi ki, ona mənim evimdə xidmət edilsin. Zövcələri ona izn verdilər. Peyğəmbər ﷺ Abbasın və başqa birisinin qoluna girib, ayaqlarını sürükləyərək (qaldığı evdən) çıxıb getdi.

(Hədisi rəvayət edən) Ubeydullah deyir ki, mən bu hədisi Abdullah ibn Abbasa danışdım. O dedi: "Bilirsən o biri kişi kim idi?" Mən: "Xeyr!"– deyə cavab verdikdə o: "Bu, Əli idi"– dedi.

Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ evinə gəldikdən və xəstəliyi bir az da şiddətləndikdən sonra dedi: "Mənim üstümə bağları açılmamış yeddi tuluq su tökün ki, bəlkə insanlara tövsiyə edə bilim."

Onu zövcəsi Həfsəyə ﷺ məxsus olan ləyənin içində otuzdurdular. Sonra biz onun üstünə su tökməyə başladıq. Nəhayət, o: "Artıq yetər"– (deyə) bizə işarə etməyə başladı. Bundan sonra camaatın qarşısına çıxdı. (əl-Buxari, 198)

١٥١ – عَنْ أَنَسٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ دَعَا بِإِنَاءٍ مِنْ مَاءٍ، فَأُتِيَ بِقَدَحٍ رَحْرَاحٍ فِيهِ شَيْءٌ مِنْ مَاءٍ، فَوَضَعَ أَصَابِعَهُ فِيهِ. قَالَ أَنَسٌ فَجَعَلْتُ أَنْظُرُ إِلَى الْمَاءِ يَنْبُعُ مِنْ بَيْنِ أَصَابِعِهِ، قَالَ أَنَسٌ فَحَزَرْتُ مَنْ تَوَضَّأَ مَا بَيْنَ السَّبْعِينَ إِلَى الثَّمَانِينَ. [رواه البخاري: ٢٠٠]

**151.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir qab su istədi. Ona içində bir az su olan ağzı geniş, çox da dərin olmayan bir qab gətirdilər. Peyğəmbər ﷺ barmaqlarını qabın içinə saldı.

Ənəs dedi: "Mən onun barmaqlarının arasından qaynayıb çıxan suya baxmağa başladım."

Ənəs dedi: "Güman edirəm ki, o sudan dəstəmaz alanların sayı yetmişlə səksən arasında idi." (əl-Buxari, 200)

## 35-ci fəsil. Bir ovuc su ilə dəstəmaz almaq

## ٣٥– باب: الْوُضُوءِ بِالْمُدِّ

١٥٢ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ يَغْسِلُ، أَوْ كَانَ يَغْتَسِلُ، بِالصَّاعِ إِلَى خَمْسَةِ أَمْدَادٍ، وَيَتَوَضَّأُ بِالْمُدِّ. [رواه البخاري: ٢٠١]

**152.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər bir saadan[1] beş mudda qədər su ilə qüsl edər, bir mudla dəstəmaz alardı. (əl-Buxari, 201)

## 36-cı fəsil. Məstlərə məsh çəkmək

## ٣٦– باب: الْمَسْحُ عَلَى الْخُفَّيْنِ

١٥٣ – عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ﷺ، عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ مَسَحَ عَلَى الْخُفَّيْنِ. وَأَنَّ عَبْدَ اللَّهِ بْنَ عُمَرَ سَأَلَ عُمَرَ عَنْ ذَلِكَ فَقَالَ نَعَمْ إِذَا حَدَّثَكَ شَيْئًا سَعْدٌ عَنِ النَّبِيِّ ﷺ فَلاَ تَسْأَلْ عَنْهُ غَيْرَهُ. [رواه البخاري: ٢٠٢]

**153.** Səd ibn Əbu Vəqqas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ məstlərə məsh çəkdi. Abdullah ibn Ömər ﷺ bu haqda Ömərdən ﷺ soruşduqda o dedi: "Bəli, (belədir). Səd ﷺ Peyğəmbərdən ﷺ sənə bir hədis danışsa, artıq bu haqda başqasından soruşma." (əl-Buxari, 202)

١٥٤ – عَنْ عَمْرِو بْنِ أُمَيَّةَ الضَّمْرِيِّ ﷺ، أَنَّهُ رَأَى النَّبِيَّ ﷺ يَمْسَحُ عَلَى الْخُفَّيْنِ. [رواه البخاري: ٢٠٤]

**154.** Rəvayət edilir ki, Amr ibn Ümeyyə əd-Damri ﷺ Peyğəmbərin ﷺ məstlərə məsh çəkdiyini görmüşdür. (əl-Buxari, 204)

١٥٥ – عَنْ عَمْرِو بْنِ أُمَيَّةَ الضَّمْرِيِّ ﷺ قَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ يَمْسَحُ عَلَى عِمَامَتِهِ وَخُفَّيْهِ. [رواه البخاري: ٢٠٥]

**155.** Amr ibn Ümeyyə əd-Damri ﷺ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ əmmaməsinə və məstlərinə məsh çəkdiyini gördüm. (əl-Buxari, 205)

---

[1] Saa – ölçü vahididir və dörd mudda bərabərdir. Bir mudd isə insanın iki ovucuna bərabərdir ki, bu da yeddi yüz qrama bərabərdir. (Səmərul Müstətab, 1/28)

## 37-ci fəsil. Dəstəmazlı ikən ayaqlarına (məst) geyinənin hökmü

## ٣٧– باب: إِذَا أَدْخَلَ رِجْلَيْهِ وَهُمَا طَاهِرَتَان

١٥٦ – عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ﷺ قَالَ: كُنْتُ مَعَ النَّبِيِّ ﷺ فِي سَفَرٍ، فَأَهْوَيْتُ لأَنْزِعَ خُفَّيْهِ فَقَالَ «دَعْهُمَا، فَإِنِّي أَدْخَلْتُهُمَا طَاهِرَتَيْنِ» فَمَسَحَ عَلَيْهِمَا. [رواه البخاري: ٢٠٦]

**156.** Muğira ibn Şobə ﷺ rəvayət edir ki, mən Peyğəmbər ﷺ ilə bir yerdə səfərdə idim. Mən əyilib onun məstlərini çıxarmaq istədikdə: "Toxunma onlara! Mən onları *ayaqlarım* pak olduğu halda geyindim"– dedi və (məstlərinə) məsh çəkdi. (əl-Buxari, 206)

## 38-ci fəsil. Qoyun əti və sıyıq yedikdən sonra dəstəmaz almayan kimsə

## ٣٨– باب: مَنْ لَمْ يَتَوَضَّأْ مِنْ لَحْمِ الشَّاةِ وَالسَّوِيقِ

١٥٧ – عَنْ عَمْرِو بْنِ أُمَيَّةَ الضَّمْرِيِّ ﷺ، أَنَّهُ رَأَى رَسُولَ اللَّهِ ﷺ يَحْتَزُّ مِنْ كَتِفِ شَاةٍ، فَدُعِيَ إِلَى الصَّلاَةِ فَأَلْقَى السِّكِّينَ فَصَلَّى وَلَمْ يَتَوَضَّأْ. [رواه البخاري: ٢٠٨]

**157.** Amr ibn Ümeyyə əd-Damri ﷺ rəvayət edir ki, o, Peyğəmbərin ﷺ (bişmiş) qoyunun kürəyindən kəsib (yediyini) görmüşdür. O vaxt Peyğəmbər ﷺ namaza çağırıldıqda əlindəki bıçağı yerə atıb, dəstəmaz almadan namaz qılmışdır. (əl-Buxari, 208)

## 39-cu fəsil. Sıyıq yedikdən sonra dəstəmaz almayıb, yalnız ağzını yaxalayan kimsə

## ٣٩– باب: مَنْ مَضْمَضَ مِنَ السَّوِيقِ وَلَمْ يَتَوَضَّأْ

١٥٨ – عَنْ سُوَيْدِ بْنِ النُّعْمَانِ ﷺ، أَنَّهُ خَرَجَ مَعَ رَسُولِ اللَّهِ ﷺ عَامَ خَيْبَرَ، حَتَّى إِذَا كَانُوا بِالصَّهْبَاءِ – وَهِيَ أَدْنَى خَيْبَرَ – فَصَلَّى الْعَصْرَ، ثُمَّ دَعَا بِالأَزْوَادِ، فَلَمْ يُؤْتَ إِلاَّ بِالسَّوِيقِ، فَأَمَرَ بِهِ فَثُرِّيَ، فَأَكَلَ رَسُولُ اللَّهِ ﷺ وَأَكَلْنَا، ثُمَّ قَامَ إِلَى الْمَغْرِبِ، فَمَضْمَضَ وَمَضْمَضْنَا، ثُمَّ صَلَّى وَلَمْ يَتَوَضَّأْ. [رواه البخاري: ٢٠٩]

**158.** Suveyd ibn Nomən ﷺ rəvayət edir ki, o, Xeybər ilində Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxdı. Nəhayət, gəlib Xeybərin yaxınlığında yerləşən Səhbaya yetişdikdə əsr namazını qıldırdı. Sonra (yola götürülmüş) azuqəni gətirməyi buyurdu. (Ona) sıyıqdan başqa bir şey gətirmədilər. Peyğəmbər ﷺ (əshabələrinə) sıyığı islatmağı əmr etdi. Sonra həm Peyğəmbər ﷺ, həm də biz (o sıyıqdan) yedik. Sonra Peyğəmbər ﷺ məğrib namazını qılmaq üçün ayağa qalxdı, ağzını yaxaladı, biz də ağzımızı yaxaladıq; sonra da dəstəmaz almadan namaz qıldırdı. (əl-Buxari, 209)

١٥٩ – عَنْ مَيْمُونَةَ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ أَكَلَ عِنْدَهَا كَتِفًا، ثُمَّ صَلَّى وَلَمْ يَتَوَضَّأْ. [رواه البخاري: ٢١٠]

**159.** Meymunə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ onun evində (qoyunun) kürəyindən yedikdən sonra dəstəmaz almadan namaz qıldı. (əl-Buxari, 210)

## ٤٠– باب: هَلْ يُمَضْمِضُ مِنَ اللَّبَنِ

## 40-cı fəsil. Süd içdikdən sonra ağızı yaxalamaq lazımdırmı

١٦٠ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما، أَنَّ رَسُولَ اللَّهِ ﷺ شَرِبَ لَبَنًا، فَمَضْمَضَ وَقَالَ: «إِنَّ لَهُ دَسَمًا». [رواه البخاري: ٢١١]

**160.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ süd içdikdən sonra ağzını yaxaladı və: "Bu, yağlıdır"– dedi. (əl-Buxari, 211)

## ٤١– باب: الْوُضُوءُ مِنَ النَّوْمِ وَمَنْ لَمْ يَرَ مِنَ النَّعْسَةِ وَالنَّعْسَتَيْنِ أَوِ الْخَفْقَةِ وُضُوءًا

## 41-ci fəsil. Yuxudan oyandıqdan sonra dəstəmaz almaq və bir də mürgüləməyə görə dəstəmaz almağı vacib saymayan kimsə

١٦١ – عَنْ عَائِشَةَ رضي الله عنها، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا نَعَسَ أَحَدُكُمْ وَهُوَ يُصَلِّى فَلْيَرْقُدْ حَتَّى يَذْهَبَ عَنْهُ النَّوْمُ، فَإِنَّ أَحَدَكُمْ إِذَا صَلَّى وَهُوَ نَاعِسٌ لاَ يَدْرِى لَعَلَّهُ يَسْتَغْفِرُ فَيَسُبَّ نَفْسَهُ». [رواه البخاري: ٢١٢]

**161.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz namaz qılarkən mürgüləyərsə, qoy yuxusu dağılıb gedincəyədək yatsın. Çünki o, yuxuladığı halda namaz qıldığı zaman ola bilər ki, heç özü də bilmədən bağışlanma diləmək əvəzinə özünü söysün." (əl-Buxari, 212)

١٦٢ – عَنْ أَنَسٍ رضي الله عنه، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «إِذَا نَعَسَ أَحَدُكُمْ فِى الصَّلاَةِ فَلْيَنَمْ حَتَّى يَعْلَمَ مَا يَقْرَأُ». [رواه البخاري: ٢١٣]

**162.** Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz namaz qılarkən mürgüləsə, qoy yatsın (ki, sonra namaz qıldıqda) nə oxuduğunu bilsin." (əl-Buxari, 213)

## ٤٢– باب: الْوُضُوءُ مِنْ غَيْرِ حَدَثٍ

## 42-ci fəsil. Dəstəmazlı ikən dəstəmaz almaq

١٦٣ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: كَانَ النَّبِىُّ ﷺ يَتَوَضَّأُ عِنْدَ كُلِّ صَلاَةٍ. قَالَ: يُجْزِئُ أَحَدَنَا الْوُضُوءُ مَا لَمْ يُحْدِثْ. [رواه البخاري: ١٣٥]

**163.** Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ hər namazdan əvvəl dəstəmaz alardı. Bizlərdən hər kəs dəstəmazı pozulana qədər bir dəstəmazla namaz qılardı. (əl-Buxari, 214)

## ٤٣– باب: مِنَ الْكَبَائِرِ أَنْ لاَ يَسْتَتِرَ مِنْ بَوْلِهِ

## 43-cü fəsil. **Sidiyin** (paltara və ya bədənə düşməsindən) **qorunmamaq böyük günahlardandır**

١٦٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: مَرَّ النَّبِىُّ ﷺ بِحَائِطٍ مِنْ حِيطَانِ الْمَدِينَةِ أَوْ مَكَّةَ، فَسَمِعَ صَوْتَ إِنْسَانَيْنِ يُعَذَّبَانِ فِى قُبُورِهِمَا، فَقَالَ النَّبِىُّ ﷺ «يُعَذَّبَانِ، وَمَا يُعَذَّبَانِ فِى كَبِيرٍ»، ثُمَّ قَالَ: «بَلَى، كَانَ أَحَدُهُمَا لاَ يَسْتَتِرُ مِنْ بَوْلِهِ،

وَكَانَ الآخَرُ يَمْشِي بِالنَّمِيمَةِ». ثُمَّ دَعَا بِجَرِيدَةٍ فَكَسَرَهَا كِسْرَتَيْنِ، فَوَضَعَ عَلَى كُلِّ قَبْرٍ مِنْهُمَا كِسْرَةً. فَقِيلَ لَهُ يَا رَسُولَ اللَّهِ لِمَ فَعَلْتَ هَذَا قَالَ: «لَعَلَّهُ أَنْ يُخَفَّفَ عَنْهُمَا مَا لَمْ تَيْبَسَا». [رواه البخاري: ٢١٦]

**164.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Mədinə (və ya Məkkə) bostanlarından birinin yanından keçərkən qəbirlərində əzab çəkən iki adamın səsini eşitdi. Peyğəmbər ﷺ: "(Bunlar) əzab çəkirlər, amma böyük bir şeyə görə əzab çəkmirlər"– dedi. Sonra (bunun səbəbini bildirib) dedi: "Bəli, bunlardan biri sidikdən qorunmazdı, digəri isə söz gəzdirərdi." Sonra o, bir xurma budağı gətirməyi əmr etdi. Budağı iki böldü. Hər birinin qəbrinin üstünə bir yarısını sancdı. Ondan: "Ya Rəsulullah! Nə üçün belə etdin?"– deyə soruşdular. Dedi: "Ola bilsin ki, bunlar quruyanadək onların əzabı yüngülləşsin" (əl-Buxari, 216)

### 44-cü fəsil. Sidiyi yumaq haqqında varid olan (hədis)

### ٤٤– باب: مَا جَاءَ فِي غَسْلِ الْبَوْلِ

١٦٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا تَبَرَّزَ لِحَاجَتِهِ أَتَيْتُهُ بِمَاءٍ فَيَغْسِلُ بِهِ. [رواه البخاري: ٢١٧]

**165.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etmək üçün bayıra çıxdıqda mən ona su gətirərdim və o, su ilə yuyunardı. (əl-Buxari, 217)

### 45-ci fəsil. Peyğəmbərin ﷺ və camaatın bədəviyə, məsciddə təbii ehtiyacını rəf edib qurtaranadək toxunmaması

### ٤٥– باب: تَرْكُ النَّبِيِّ ﷺ وَالنَّاسِ الأَعْرَابِيَّ حَتَّى فَرَغَ مِنْ بَوْلِهِ فِي الْمَسْجِدِ

١٦٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَامَ أَعْرَابِيٌّ فَبَالَ فِي الْمَسْجِدِ فَتَنَاوَلَهُ النَّاسُ، فَقَالَ لَهُمُ النَّبِيُّ ﷺ «دَعُوهُ وَهَرِيقُوا عَلَى بَوْلِهِ سَجْلاً مِنْ مَاءٍ، أَوْ ذَنُوبًا مِنْ مَاءٍ، فَإِنَّمَا بُعِثْتُمْ مُيَسِّرِينَ، وَلَمْ تُبْعَثُوا مُعَسِّرِينَ». [رواه البخاري: ٢٢٠]

**166.** Əbu Hureyra ﷺ rəvayət edir ki, bir bədəvi gəlib məscidə sidik ifraz etdi. Camaat qalxıb onu tənbeh etdikdə Peyğəmbər ﷺ dedi: "Buraxın onu! Sidiyinin üzərinə də bir qab (və ya bir çəllək) su tökün. Siz çətinləşdirən deyil, asanlaşdıran olaraq göndərilmisiniz." (əl-Buxari, 220)

### 46-cı fəsil. Körpələrin sidiyi

### ٤٦– باب: بَوْلُ الصِّبْيَانِ

١٦٧ – عَنْ أُمِّ قَيْسٍ بِنْتِ مِحْصَنٍ ﷺ، أَنَّهَا أَتَتْ بِابْنٍ لَهَا صَغِيرٍ، لَمْ يَأْكُلِ الطَّعَامَ إِلَى رَسُولِ اللَّهِ ﷺ، فَأَجْلَسَهُ رَسُولُ اللَّهِ ﷺ فِي حِجْرِهِ، فَبَالَ عَلَى ثَوْبِهِ، فَدَعَا بِمَاءٍ فَنَضَحَهُ وَلَمْ يَغْسِلْهُ. [رواه البخاري: ٢٢٣]

**167.** Ummu Qeys bint Mihsan ﷺ rəvayət edir ki, o, hələ yemək yeməyən (südəmər) oğlunu Peyğəmbərin ﷺ yanına gətirdi. Peyğəmbər ﷺ körpəni qucağında

otuzdurdu və uşaq onun paltarına sidik ifraz etdi. Peyğəmbər ﷺ su gətizdirib ondan paltarının üstünə səpdi və onu yumadı. (əl-Buxari, 223)

## 47-ci fəsil. Ayaq üstə və (ya) oturulu halda bövl etmək[1]

## ٤٧– باب: الْبَوْلُ قَائِمًا وَقَاعِدًا

١٦٨ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: أَتَى النَّبِيُّ ﷺ سُبَاطَةَ قَوْمٍ فَبَالَ قَائِمًا، ثُمَّ دَعَا بِمَاءٍ، فَجِئْتُهُ بِمَاءٍ فَتَوَضَّأَ. [رواه البخاري: ٢٢٤]

**168.** Huzeyfə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir qövmün zibilxanasına gəlib orada ayaq üstə bövl etdi. Sonra su gətirməyi əmr etdi. Mən ona su gətirdim və o, dəstəmaz aldı. (əl-Buxari, 224)

## 48-ci fəsil. Dost yanında və divar arxasında bövl etmək

## ٤٨– باب: الْبَوْلُ عِنْدَ صَاحِبِهِ وَالتَّسَتُّرِ بِالْحَائِطِ

١٦٩ – وَ فِي رِوَايَةٍ عَنْهُ، فَانْتَبَذْتُ مِنْهُ، فَأَشَارَ إِلَيَّ فَجِئْتُهُ، فَقُمْتُ عِنْدَ عَقِبِهِ حَتَّى فَرَغَ. [رواه البخاري: ٢٢٥]

**169.** Huzeyfə ﷺ digər rəvayətində deyir ki, mən kənara çəkildim. O, məni işarə ilə (yanına) çağırdı. O, (təbii ehtiyacını rəf edib) qurtaranadək mən onun arxa tərəfində dayandım. (əl-Buxari, 225)

## 49-cu fəsil. Qanı yumaq

## ٤٩– باب: غَسْلُ الدَّمِ

١٧٠ – عَنْ أَسْمَاءَ ﷺ قَالَتْ: جَاءَت امْرَأَةٌ النَّبِيَّ ﷺ فَقَالَتْ أَرَأَيْتَ إِحْدَانَا تَحِيضُ فِي الثَّوْبِ كَيْفَ تَصْنَعُ قَالَ: «تَحُتُّهُ، ثُمَّ تَقْرُصُهُ بِالْمَاءِ، وَتَنْضَحُهُ وَتُصَلِّي فِيهِ». [رواه البخاري: ٢٢٧]

**170.** Əsma ﷺ rəvayət edir ki, bir qadın Peyğəmbərin ﷺ yanına gəlib soruşdu: "Bizdən birimizin paltarına heyz qanı bulaşsa, o, nə etməlidir?" Peyğəmbər ﷺ buyurdu: "Onu (əli ilə) ovxalasın, sonra suya salıb yaxşıca yusun, sonra üstünə su çiləsin, sonra da onunla namaz qılsın". (əl-Buxari, 227)

١٧١ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: جَاءَتْ فَاطِمَةُ ابْنَةُ أَبِي حُبَيْشٍ إِلَى النَّبِيِّ ﷺ فَقَالَتْ يَا رَسُولَ اللَّهِ إِنِّي امْرَأَةٌ أُسْتَحَاضُ فَلاَ أَطْهُرُ، أَفَأَدَعُ الصَّلاَةَ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ «لاَ، إِنَّمَا ذَلِكِ عِرْقٌ، وَلَيْسَ بِحَيْضٍ، فَإِذَا أَقْبَلَتْ حَيْضَتُكِ فَدَعِي الصَّلاَةَ، وَإِذَا أَدْبَرَتْ فَاغْسِلِي عَنْكِ الدَّمَ ثُمَّ صَلِّي».
قَالَ: «ثُمَّ تَوَضَّئِي لِكُلِّ صَلاَةٍ، حَتَّى يَجِيءَ ذَلِكَ الْوَقْتُ». [رواه البخاري: ٢٢٨]

**171.** Aişə ﷺ rəvayət edir ki, Fatimə bint Əbu Hubeyş Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah! Məndən davamlı olaraq qan gəlir deyə mən heç cür təmiz ola bilmirəm. (Bu səbəbdən) namazı buraxa bilərəmmi?" Peyğəmbər ﷺ bu-

[1] Bövl etmək – sidik ifraz etmək, təbii ehtiyacı rəf etmək deməkdir.

yurdu: “Xeyr, bu heyz deyildir, sadəcə damar qanıdır. Heyz qanı gəldikdə namazı burax. Heyz (vaxtı) başa çatdıqda isə qüsl et, sonra namaz qıl.”

(Peyğəmbər ﷺ davam edib) dedi: “(Növbəti heyz) vaxtı gəlincəyə qədər hər bir namaz üçün dəstəmaz al.” (əl-Buxari, 228)

## 50-ci fəsil. Mənini[1] yumaq və (ya) ovxalamaq

## ٥٠– باب: غَسْلُ الْمَنِىِّ وَفَرْكِه

١٧٢ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كُنْتُ أَغْسِلُ الْجَنَابَةَ مِنْ ثَوْبِ النَّبِيِّ ﷺ، فَيَخْرُجُ إِلَى الصَّلاَةِ، وَإِنَّ بُقَعَ الْمَاءِ فِى ثَوْبِهِ. [رواه البخاري: ٢٢٩]

**172.** Aişə رضي الله عنها rəvayət edir ki, mən Peyğəmbərin ﷺ paltarına bulaşmış mənini yuyardım. Sonra o, paltarında su ləkələri olduğu halda namaza çıxardı. (əl-Buxari, 229)

## 51-ci fəsil. Dəvənin, qoyunun və digər ev heyvanlarının sidiyi və onların ağılları[2]

## ٥١– باب: أَبْوَالُ الإِبِلِ وَالدَّوَابِّ وَالْغَنَمِ وَمَرَابِضِهَا

١٧٣ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: قَدِمَ أُنَاسٌ مِنْ عُكَلٍ أَوْ عُرَيْنَةَ، فَاجْتَوَوُا الْمَدِينَةَ، فَأَمَرَهُمُ النَّبِيُّ ﷺ بِلِقَاحٍ، وَأَنْ يَشْرَبُوا مِنْ أَبْوَالِهَا وَأَلْبَانِهَا، فَانْطَلَقُوا، فَلَمَّا صَحُّوا قَتَلُوا رَاعِيَ النَّبِيِّ ﷺ وَاسْتَاقُوا النَّعَمَ، فَجَاءَ الْخَبَرُ فِى أَوَّلِ النَّهَارِ، فَبَعَثَ فِى آثَارِهِمْ، فَلَمَّا ارْتَفَعَ النَّهَارُ جِيءَ بِهِمْ، فَأَمَرَ فَقَطَعَ أَيْدِيَهُمْ وَأَرْجُلَهُمْ، وَسُمِرَتْ أَعْيُنُهُمْ، وَأُلْقُوا فِى الْحَرَّةِ يَسْتَسْقُونَ فَلاَ يُسْقَوْنَ. [رواه البخاري: ٢٣٣]

**173.** Ənəs رضي الله عنه rəvayət edir ki, Ükəl və ya Üreyn qəbiləsindən olan bir dəstə (Peyğəmbərin ﷺ yanına) gəldi. (Xəstə olduqları üçün) Mədinədə qalmaq istəmədilər. Peyğəmbər ﷺ onlara sağmal dəvələrin olduğu yerə gedib onların sidiyindən və südündən içməyi əmr etdi. Onlar (Peyğəmbərin ﷺ dediyi yerə) getdilər. Elə ki sağaldılar, Peyğəmbərin ﷺ çobanını öldürüb dəvələri sürüb apardılar. Bu xəbər günün əvvəlində (Mədinəyə) gəlib çatdı. Peyğəmbər ﷺ onların ardınca (bir dəstə) adam göndərdi. Günorta onları (Mədinəyə) gətirdilər. Peyğəmbər ﷺ onların əllərini və ayaqlarını kəsdirdi. (Sonra) onların gözlərini çıxartdılar, özlərini də Hərraya[3] atdılar. Onlar su istəyirdilər, lakin (ölənədək) onlara su verilmədi. (əl-Buxari, 233)

١٧٤ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: كَانَ النَّبِيُّ ﷺ يُصَلِّى قَبْلَ أَنْ يُبْنَى الْمَسْجِدُ فِى مَرَابِضِ الْغَنَمِ. [رواه البخاري: ٢٣٤]

**174.** Ənəs رضي الله عنه rəvayət edir ki, məscid tikilməmişdən əvvəl Peyğəmbər ﷺ qoyun ağıllarında namaz qılardı. (əl-Buxari, 234)

[1] Məni – tənasül vəzilərinin hasil etdiyi mayedir.
[2] Ağıl – içərisində mal-qara və qoyun saxlamaq üçün ətrafı tikan və ya ağac ilə hasarlanmış üstüaçıq yer.

[3] Hərra – Mədinə yaxınlığında yerləşən, qaralmış daş-kəsəklərlə dolu bir sahə nəzərədə tutulur.

## 52-ci fəsil. Yağın və suyun içinə murdar şeylərin düşməsi

## ٥٢– باب: مَا يَقَعُ مِنَ النَّجَاسَاتِ فِى السَّمْنِ وَالْمَاء

١٧٥ – عَنْ مَيْمُونَةَ رضي الله عنها، أَنَّ رَسُولَ اللَّهِ ﷺ سُئِلَ عَنْ فَأْرَةٍ سَقَطَتْ فِى سَمْنٍ فَقَالَ: «أَلْقُوهَا وَمَا حَوْلَهَا فَاطْرَحُوهُ، وَكُلُوا سَمْنَكُمْ». [رواه البخاري: ٢٣٥]

**175.** Meymunə رضي الله عنها rəvayət edir ki, Peyğəmbərdən ﷺ yağın içinə düşmüş siçan barəsində soruşdular. O buyurdu: "Siçanı və onun ətrafındakı yağı atın, yerdə qalanını isə yeyin!" (əl-Buxari, 235)

١٧٦ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «كُلُّ كَلْمٍ يُكْلَمُهُ الْمُسْلِمُ فِى سَبِيلِ اللَّهِ يَكُونُ يَوْمَ الْقِيَامَةِ كَهَيْئَتِهَا إِذْ طُعِنَتْ، تَفَجَّرُ دَمًا، اللَّوْنُ لَوْنُ الدَّمِ، وَالْعَرْفُ عَرْفُ الْمِسْكِ». [رواه البخاري: ٢٣٧]

**176.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlmanın Allah yolunda aldığı hər bir yara Qiyamət günü, (ilk dəfə) açıldığı vaxtda olduğu kimi ondan qan fışqıracaq; rəngi qan rəngi, qoxusu isə müşk qoxusu olacaqdır." (əl-Buxari, 237)

## 53-cü fəsil. Durğun suya bövl etmək

## ٥٣– باب: الْبَوْلُ فِى الْمَاءِ الدَّائِمِ

١٧٧ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه، عَنِ النَّبِىِّ ﷺ أَنَّهُ قَالَ: «لاَ يَبُولَنَّ أَحَدُكُمْ فِى الْمَاءِ الدَّائِمِ الَّذِى لاَ يَجْرِى، ثُمَّ يَغْتَسِلُ فِيهِ». [رواه البخاري: ٢٣٩]

**177.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heç biriniz durğun suya bövl etməsin. (Çünki) sonra ondan yuyunmaq üçün istifadə edəcək." (əl-Buxari, 239)

## 54-cü fəsil. Namaz qılanın belinə napak bir şey və ya cəmdək atıldığı zaman o kimsənin namazı batil olmaz

## ٥٤– باب: إِذَا أُلْقِىَ عَلَى ظَهْرِ الْمُصَلِّى قَذَرٌ أَوْ جِيفَةٌ لَمْ تَفْسُدْ عَلَيْهِ صَلاَتُه

١٧٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ رضي الله عنه، أَنَّ النَّبِىَّ ﷺ كَانَ يُصَلِّى عِنْدَ الْبَيْتِ، وَأَبُو جَهْلٍ وَأَصْحَابٌ لَهُ جُلُوسٌ، إِذْ قَالَ بَعْضُهُمْ لِبَعْضٍ أَيُّكُمْ يَجِىءُ بِسَلَى جَزُورِ بَنِى فُلاَنٍ فَيَضَعُهُ عَلَى ظَهْرِ مُحَمَّدٍ إِذَا سَجَدَ فَانْبَعَثَ أَشْقَى الْقَوْمِ فَجَاءَ بِهِ، فَنَظَرَ حَتَّى إِذَا سَجَدَ النَّبِىُّ ﷺ وَضَعَهُ عَلَى ظَهْرِهِ بَيْنَ كَتِفَيْهِ وَأَنَا أَنْظُرُ، لاَ أُغَيِّرُ شَيْئًا، لَوْ كَانَ لِى مَنْعَةٌ. قَالَ فَجَعَلُوا يَضْحَكُونَ وَيُحِيلُ بَعْضُهُمْ عَلَى بَعْضٍ، وَرَسُولُ اللَّهِ ﷺ سَاجِدٌ لاَ يَرْفَعُ رَأْسَهُ، حَتَّى جَاءَتْهُ فَاطِمَةُ، فَطَرَحَتْ عَنْ ظَهْرِهِ، فَرَفَعَ رَأْسَهُ ثُمَّ قَالَ: «اللَّهُمَّ عَلَيْكَ بِقُرَيْشٍ». ثَلاَثَ مَرَّاتٍ، فَشَقَّ عَلَيْهِمْ إِذْ دَعَا عَلَيْهِمْ – قَالَ وَكَانُوا يُرَوْنَ أَنَّ الدَّعْوَةَ فِى ذَلِكَ الْبَلَدِ مُسْتَجَابَةٌ – ثُمَّ سَمَّى «اللَّهُمَّ عَلَيْكَ بِأَبِى جَهْلٍ، وَعَلَيْكَ بِعُتْبَةَ بْنِ

رَبِيعَةَ، وَشَيْبَةَ بْنِ رَبِيعَةَ، وَالْوَلِيدِ بْنِ عُتْبَةَ، وَأُمَيَّةَ بْنِ خَلَفٍ، وَعُقْبَةَ بْنِ أَبِى مُعَيْطٍ». وَعَدَّ السَّابِعَ فَلَمْ يَحْفَظْهُ قَالَ فَوَالَّذِى نَفْسِى بِيَدِهِ، لَقَدْ رَأَيْتُ الَّذِينَ عَدَّ رَسُولُ اللَّهِ ﷺ صَرْعَى فِى الْقَلِيبِ قَلِيبِ بَدْرٍ. [رواه البخاري: ٢٤٠]

**178.** Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Kəbənin yanında namaz qılarkən Əbu Cəhl və onun dostları (yaxınlıqda bir yerdə) oturmuşdular. Onlardan biri digərlərinə: "Hansı biriniz filan qəbilənin (kəsdiyi) dişi dəvənin döl qişasını[1] gətirib Muhəmməd səcdə edərkən onun belinə qoya bilər?"– dedi. Onların ən bədbəxti gedib onu gətirdi və bir az gözlədi. Nəhayət, Peyğəmbər ﷺ səcdə etdikdə onu Peyğəmbərin ﷺ belinə – kürəklərinin arasına qoydu. Mən (bunu) görürdüm, lakin qarşısını almağa qadir deyildim. Kaş (bunun) qarşısını ala biləcək qədər gücüm olaydı.

(Abdullah ibn Məsud ﷺ rəvayətinə davam edib) dedi: "Onlar (barmaqla) bir-birlərinə işarə edərək gülməyə başladılar. Allahın elçisi ﷺ isə səcdədən başını qaldırmırdı. Nəhayət, Fatimə onun yanına gəldi və (qişanı) belindən götürüb kənara atdı. Peyğəmbər ﷺ başını qaldırdı və (namazı bitirdikdən) sonra üç dəfə: "Allahım, Qureyşin cəzasını ver!"– dedi. Peyğəmbərin ﷺ bəddua etməsi onlara pis təsir etdi. Çünki onlar bu şəhərdə edilən bədduanın qəbul olunacağına inanırdılar. Sonra Peyğəmbər ﷺ adbaad sayaraq: "Allahım, Əbu Cəhlin cəzasını ver! Utbə ibn Rəbiyənin, Şeybə ibn Rəbiyənin, Vəlid ibn Utbənin, Umeyyə ibn Xələfin və Uqbə ibn Əbu Muitin cəzasını ver!"– dedi."

O, yeddincisinin də adını çəkdi, lakin (ravi) bunu yadda saxlaya bilmədi.

(Abdullah ibn Məsud ﷺ rəvayətinə davam edib) dedi: "Canım Əlində olan Allaha and olsun ki, Allahın elçisinin ﷺ adlarını çəkdiyi kəsləri Bədr[2] quyularından birində yerə sərilmiş gördüm." (əl-Buxari, 240)

## 55-ci fəsil. Tüpürcəyin, burundan axan seliyin və buna bənzər şeylərin paltara bulaşması

## ٥٥– باب: الْبُزَاقُ وَالْمُخَاطِ وَنَحْوِهِ فِى الثَّوْبِ

١٧٩ – عَنْ أَنَسٍ ﷺ قَالَ: بَزَقَ النَّبِىُّ ﷺ فِى ثَوْبِهِ. [رواه البخاري: ٢٤١]

**179.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ paltarının içinə tüpürdü. (əl-Buxari, 241)

## 56-cı fəsil. Qadının öz atasının üzündən qanı silməsi

## ٥٦– باب: غَسْلُ الْمَرْأَةِ أَبَاهَا الدَّمَ عَنْ وَجْهِهِ

١٨٠ – عَنْ سَهْلَ بْنَ سَعْد السَّاعِدىَّ ﷺ، أَنَّهُ سَأَلَهُ النَّاسُ بِأَىِّ شَىْءٍ دُووِىَ جُرْحُ النَّبِىِّ ﷺ فَقَالَ مَا بَقِىَ أَحَدٌ أَعْلَمُ بِهِ مِنِّى، كَانَ عَلِىٌّ يَجِىءُ بِتُرْسِهِ فِيهِ مَاءٌ، وَفَاطِمَةُ تَغْسِلُ عَنْ وَجْهِهِ الدَّمَ، فَأُخِذَ حَصِيرٌ فَأُحْرِقَ فَحُشِىَ بِهِ جُرْحُهُ. [رواه البخاري: ٢٤٣]

---

[1] Heyvanın qarnındakı rüşeymin üstünü örtən pərdə.

[2] Mədinədən 150 km cənubda yerləşən bir yerdir. İslam tarixində müsəlmanlarla kafirlər arasında ilk iri miqyaslı döyüş keçirilmiş yerdir.

**180.** İnsanlar Səhl ibn Səd əs-Saididən ﷺ: “Peyğəmbərin ﷺ yarası nə ilə müalicə edildi?”– deyə soruşdular. Səhl dedi: “Bunu məndən yaxşı bilən bir kimsə qalmayıb. (O zaman) Əli qalxanının içində su gətirir, Fatimə ﷺ də (Peyğəmbərin ﷺ) üzündəki qanı yuyurdu. Sonra (bir parça) həsir götürüb yandırdılar və (külünü) onun yarasına basdılar.” (əl-Buxari, 243)

## 57-ci fəsil. Misvak

## ٥٧– باب: السِّوَاكُ

١٨١ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: أَتَيْتُ النَّبِيَّ ﷺ فَوَجَدْتُهُ يَسْتَنُّ بِسِوَاكٍ بِيَدِهِ يَقُولُ «أُعْ أُعْ»، وَالسِّوَاكُ فِى فِيهِ، كَأَنَّهُ يَتَهَوَّعُ. [رواه البخاري: ٢٤٤]

**181.** Əbu Musa ﷺ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ yanına gəlib onun əlindəki misvakla[1] dişlərini təmizlədiyini və ağzında misvak olduğu halda sanki öyüyürmüş kimi «u', u'»– səsi çıxartdığını gördüm. (əl-Buxari, 244)

١٨٢ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا قَامَ مِنَ اللَّيْلِ يَشُوصُ فَاهُ بِالسِّوَاكِ. [رواه البخاري: ٢٤٥]

**182.** Huzeyfə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə yuxudan oyandıqda ağzını misvakla təmizləyərdi. (əl-Buxari, 245)

## 58-ci fəsil. Misvakı daha yaşlı olana vermək

## ٥٨– باب: دَفْعُ السِّوَاكِ إِلَى الأَكْبَرِ

١٨٣ – عَنِ ابْنِ عُمَرَ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «أَرَانِى أَتَسَوَّكُ بِسِوَاكٍ، فَجَاءَنِى رَجُلاَنِ أَحَدُهُمَا أَكْبَرُ مِنَ الآخَرِ، فَنَاوَلْتُ السِّوَاكَ الأَصْغَرَ مِنْهُمَا، فَقِيلَ لِى كَبِّرْ. فَدَفَعْتُهُ إِلَى الأَكْبَرِ مِنْهُمَا». [رواه البخاري: ٢٤٦]

**183.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Yuxuda gördüm ki, misvakla dişlərimi təmizləyirəm. (Elə bu vaxt) mənim yanıma birisi digərindən yaşlı olan iki nəfər gəldi. Mən misvakı onlardan kiçik olanına uzatdım. Mənə: “Böyüyə ver”– deyildi. Mən də onu daha böyük olanına verdim.” (əl-Buxari, 246)

## 59-cu fəsil. Dəstəmazlı halda yatan kimsənin fəziləti

## ٥٩– باب: فَضْلُ مَنْ بَاتَ عَلَى الْوُضُوءِ

١٨٤ – عَنْ الْبَرَاءِ بْنِ عَازِبٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ «إِذَا أَتَيْتَ مَضْجَعَكَ فَتَوَضَّأْ وُضُوءَكَ لِلصَّلاَةِ، ثُمَّ اضْطَجِعْ عَلَى شِقِّكَ الأَيْمَنِ، ثُمَّ قُلِ اللَّهُمَّ أَسْلَمْتُ وَجْهِى إِلَيْكَ، وَفَوَّضْتُ أَمْرِى إِلَيْكَ، وَأَلْجَأْتُ ظَهْرِى إِلَيْكَ، رَغْبَةً وَرَهْبَةً إِلَيْكَ، لاَ مَلْجَأَ وَلاَ مَنْجَا مِنْكَ إِلاَّ إِلَيْكَ، اللَّهُمَّ آمَنْتُ بِكِتَابِكَ الَّذِى أَنْزَلْتَ، وَبِنَبِيِّكَ الَّذِى أَرْسَلْتَ. فَإِنْ مُتَّ مِنْ لَيْلَتِكَ فَأَنْتَ عَلَى الْفِطْرَةِ، وَاجْعَلْهُنَّ آخِرَ مَا تَتَكَلَّمُ بِهِ». قَالَ فَرَدَّدْتُهَا عَلَى النَّبِىِّ ﷺ فَلَمَّا بَلَغْتُ «اللَّهُمَّ آمَنْتُ بِكِتَابِكَ الَّذِى أَنْزَلْتَ». قُلْتُ وَرَسُولِكَ. قَالَ: «لاَ، وَنَبِيِّكَ الَّذِى أَرْسَلْتَ». [رواه البخاري: ٢٤٧]

[1] Misvak – ərak ağacından dişləri təmizləmək üçün düzəldilmiş təbii fırça.

**184.** Bəra ibn Azib ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “Yatmaq istədikdə namaz üçün dəstəmaz aldığın kimi dəstəmaz al; sonra sağ böyrün üstə uzan; sonra de: “Allahım, Sənə ümid edərək və Səndən qorxaraq üzümü Sənə təslim etdim, işimi Sənə həvalə etdim, kürəyimi Sənə etibar etdim. Sığınacaq və Sənin (əzabından) xilas olmaq üçün nicat yeri yalnız Sənə yönəlməkdir. Allahım, Sənin nazil etdiyin Kitaba və göndərdiyin Peyğəmbərə iman gətirdim!”[1] Əgər o gecə ölsən, fitrət üzərində (müsəlman olaraq) öləcəksən. Sən bu sözləri, dediyin sözlərin axırıncısı et.”

(Bəra ibn Azib ﵁) deyir ki, mən bu duanı Peyğəmbərə ﷺ oxudum və gəlib: “Sənin nazil etdiyin Kitaba iman gətirdim” sözünə yetişdikdə “və göndərdiyin Elçiyə”– dedim. O buyurdu: “Xeyr, göndərdiyin Peyğəmbərə”– (de). (əl-Buxari, 247)

[1] Transkripsiyası: Allahummə, əsləmtu vəchi ileykə, və fəvvədtu əmri ileykə, və əlcə'tu zahri ileykə, rağbətən və rahbətən ileyk. Lə məlcə'ə və lə məncəə minkə illə ileyk. Allahummə, aməntu bikitabikəl-ləzi ənzəltə və binəbiyyikəl-ləzi ərsəltə.

# ٥ – كِتَابُ الغُسْلِ

# 5 – Qüsl kitabı

## ١– باب: الوُضُوءُ قَبْلَ الغُسْلِ

## 1-ci fəsil. Qüsldən əvvəl dəstəmaz almaq

١٨٥ – عَنْ عَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ رضي الله عنها، أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ بَدَأَ فَغَسَلَ يَدَيْهِ، ثُمَّ يَتَوَضَّأُ كَمَا يَتَوَضَّأُ لِلصَّلَاةِ، ثُمَّ يُدْخِلُ أَصَابِعَهُ فِي الْمَاءِ، فَيُخَلِّلُ بِهَا أُصُولَ شَعَرِهِ ثُمَّ يَصُبُّ عَلَى رَأْسِهِ ثَلَاثَ غُرَفٍ بِيَدَيْهِ، ثُمَّ يُفِيضُ الْمَاءَ عَلَى جِلْدِهِ كُلِّهِ. [رواه البخاري: ٢٤٨]

**185.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ cunub olduqdan sonra qüsl etdikdə əvvəlcə əllərini yuyardı. Sonra namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı. Sonra barmaqlarını suyun içinə salar və onlarla saçlarının dibini isladardı. Sonra əlləri ilə başına üç ovuc su tökər, sonra da bütün bədəninə su əndərərdi. (əl-Buxari, 248)

١٨٦ – عَنْ مَيْمُونَةَ زَوْجِ النَّبِيِّ ﷺ رضي الله عنها قَالَتْ: تَوَضَّأَ رَسُولُ اللَّهِ ﷺ وُضُوءَهُ لِلصَّلَاةِ غَيْرَ رِجْلَيْهِ، وَغَسَلَ فَرْجَهُ، وَمَا أَصَابَهُ مِنَ الأَذَى، ثُمَّ أَفَاضَ عَلَيْهِ الْمَاءَ، ثُمَّ نَحَّى رِجْلَيْهِ فَغَسَلَهُمَا، هَذِهِ غُسْلُهُ مِنَ الْجَنَابَةِ. [رواه البخاري: ٢٤٩]

**186.** Meymunə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqlarından başqa (dəstəmaz əzalarını yuyaraq) namaz üçün dəstəmaz aldığı kimi, dəstəmaz aldı. (Sonra) o, cinsiyyət orqanını və ona bulaşmış ifrazatı yudu. Sonra üstünə su əndərdi. Sonra ayaqlarını bir kənara çəkib yudu. Onun cunub ikən etdiyi qüsl belə idi. (əl-Buxari, 249)

## ٢– باب: غُسْلُ الرَّجُلِ مَعَ امْرَأَتِهِ

## 2-ci fəsil. Kişinin öz zövcəsi ilə birlikdə çimməsi

١٨٧ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كُنْتُ أَغْتَسِلُ أَنَا وَالنَّبِيُّ ﷺ مِنْ إِنَاءٍ وَاحِدٍ مِنْ قَدَحٍ يُقَالُ لَهُ الْفَرَقُ. [رواه البخاري: ٢٥٠]

**187.** Aişə رضي الله عنها rəvayət edir ki, mən Peyğəmbərlə ﷺ birlikdə bir qabdan – "fərəq" deyilən bir qədəhdən su götürüb qüsl edərdik. (əl-Buxari, 250)

## ٣– باب: الْغُسْلُ بِالصَّاعِ وَنَحْوِهِ

## 3-cü fəsil. Bir saa[1] və buna yaxın miqdarda (su ilə) qüsl etmək

١٨٨ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهَا سُئِلَتْ عَنْ غُسْلِ النَّبِيِّ ﷺ فَدَعَتْ بِإِنَاءٍ نَحْوًا مِنْ صَاعٍ، فَاغْتَسَلَتْ وَأَفَاضَتْ عَلَى رَأْسِهَا، وَبَيْنَنَا وَبَيْنَهَا حِجَابٌ. [رواه البخاري: ٢٥١]

[1] Bir saa – dörd mudda bərabərdir. Bir mudd isə insanın iki ovcuna bərabərdir.

**188.** Aişədən ﵂ Peyğəmbərin ﷺ qüslü barədə soruşdular. Aişə bir qab – təxminən bir saa (miqdarında su) gətizdirdi. Qüsl etdi və başına su əndərdi. (Bu əsnada) bizimlə onun arasında pərdə tutulmuşdu. (əl-Buxari, 251)

**١٨٩** – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵄ أَنَّهُ سَأَلَهُ رَجُلٌ عَنِ الْغُسْلِ. فَقَالَ يَكْفِيكَ صَاعٌ. فَقَالَ رَجُلٌ مَا يَكْفِينِى. فَقَالَ جَابِرٌ كَانَ يَكْفِى مَنْ هُوَ أَوْفَى مِنْكَ شَعَرًا، وَخَيْرٌ مِنْكَ، ثُمَّ أَمَّنَا فِى ثَوْبٍ. [رواه البخاري: ٢٥٢]

**189.** Bir adam Cabir ibn Abdullahdan ﵄ qüsl barəsində soruşdu. Cabir: "Sənə bir saa (su) kifayət edər"– deyə cavab verdi. (Oradakılardan) birisi: "Mənə bəs eləmir"– dedikdə Cabir: "Saçı sənin (saçından) daha gur, özü də səndən daha xeyirli olan birisinə bəs edərdi"– dedi, sonra əynində bir paltar olduğu halda bizə imamlıq edib (namaz qıldırdı). (əl-Buxari, 252)

## 4-cü fəsil. Başına üç dəfə su tökən kimsə

## ٤– باب: مَنْ أَفَاضَ عَلَى رَأْسِهِ ثَلاَثًا

**١٩٠** – عَنْ جُبَيْرُ بْنُ مُطْعِمٍ ﵁ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ «أَمَّا أَنَا فَأُفِيضُ عَلَى رَأْسِى ثَلاَثًا». وَأَشَارَ بِيَدَيْهِ كِلْتَيْهِمَا. [رواه البخاري: ٢٥٤]

**190.** Cubeyr ibn Mutim ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ: "Mənə gəldikdə isə, mən başıma üç dəfə su tökürəm"– dedi və (bunu başa salmaq üçün) iki əli ilə işarə etdi. (əl-Buxari, 254)

## 5-ci fəsil. Badyadan[1] (su götürüb) qüsl edən kimsə

## ٥– باب: مَنْ بَدَأَ بِالْحِلاَبِ أَوِ الطِّيبِ عِنْدَ الْغُسْلِ

**١٩١** – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كَانَ النَّبِىُّ ﷺ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ دَعَا بِشَىْءٍ نَحْوَ الْحِلاَبِ، فَأَخَذَ بِكَفِّهِ، فَبَدَأَ بِشِقِّ رَأْسِهِ الأَيْمَنِ ثُمَّ الأَيْسَرِ، فَقَالَ بِهِمَا عَلَى رَأْسِهِ. [رواه البخاري: ٢٥٨]

**191.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ cunub olduğu zaman qüsl etmək istədikdə badya boyda bir qabda (su) gətizdirər, əli ilə (su) götürüb əvvəlcə başının sağ tərəfini, sonra da sol tərəfini yuyardı. Sonra iki əli ilə (su götürüb) başına tökərdi. (əl-Buxari, 258)

## 6-cı fəsil. Cinsi əlaqəyə girdikdən sonra bunu bir daha təkrar etmək

## ٦– باب: إِذَا جَامَعَ ثُمَّ عَادَ

**١٩٢** – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كُنْتُ أُطَيِّبُ رَسُولَ اللَّهِ ﷺ، فَيَطُوفُ عَلَى نِسَائِهِ، ثُمَّ يُصْبِحُ مُحْرِمًا يَنْضَخُ طِيبًا. [رواه البخاري: ٢٦٧]

---

[1] Badya – içinə süd sağmaq, yaxud maye tökmək üçün misdən, saxsıdan və sairədən düzəldilmiş altı gen böyük qab.

**192.** Aişə ﵂ rəvayət edir ki, mən Peyğəmbərə ﷺ ətir vurardım; o da öz zövcələri ilə (birbəbir) yaxınlıq edərdi. Səhəri gün isə bədənindən ətir qoxusu gəldiyi halda ihrama girərdi. (əl-Buxari, 267)

**١٩٣ –** عَنْ أَنَسٍ ﵁ قَالَ: كَانَ النَّبِيُّ ﷺ يَدُورُ عَلَى نِسَائِهِ فِي السَّاعَةِ الْوَاحِدَةِ مِنَ اللَّيْلِ وَالنَّهَارِ، وَهُنَّ إِحْدَى عَشْرَةَ. و فِي رِوَايَةٍ تِسْعُ نِسْوَةٍ. قِيلَ لأَنَسٍ: أَوَكَانَ يُطِيقُهُ قَالَ كُنَّا نَتَحَدَّثُ أَنَّهُ أُعْطِيَ قُوَّةَ ثَلاثِينَ. [رواه البخاري: ٢٦٨]

**193.** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ gecənin və ya gündüzün bir vaxtında öz qadınları ilə yaxınlıq edərdi. Onlar on bir qadın idi. (Digər rəvayətdə deyilir ki, onlar doqquz qadın idi).

Ənəsdən ﵁: "Onun buna taqəti çatırdımı?"– deyə soruşdular. O dedi: "Biz öz aramızda deyərdik ki, ona otuz (kişinin) gücü verilmişdir." (əl-Buxari, 268)

## ٧– باب: مَنْ تَطَيَّبَ ثُمَّ اغْتَسَلَ

## 7-ci fəsil. Ətirləndikdən sonra qüsl edən kimsə

**١٩٤ –** عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كَأَنِّي أَنْظُرُ إِلَى وَبِيصِ الطِّيبِ فِي مَفْرِقِ النَّبِيِّ ﷺ وَهْوَ مُحْرِمٌ. [رواه البخاري: ٢٧١]

**194.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ ihramda ikən, onun saç ayrımındakı ətrin parıltısı indiyə qədər gözlərimin önündədir. (əl-Buxari, 271)

## ٨– باب: تَخْلِيلُ الشَّعَرِ أَثْنَاءَ الغُسْلِ

## 8-ci fəsil. Qüsl əsnasında saçların dibini ovxalamaq

**١٩٥ –** عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا اغْتَسَلَ مِنَ الْجَنَابَةِ غَسَلَ يَدَيْهِ، وَتَوَضَّأَ وُضُوءَهُ لِلصَّلاَةِ ثُمَّ اغْتَسَلَ، ثُمَّ يُخَلِّلُ بِيَدِهِ شَعَرَهُ، حَتَّى إِذَا ظَنَّ أَنْ قَدْ أَرْوَى بَشَرَتَهُ، أَفَاضَ عَلَيْهِ الْمَاءَ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ غَسَلَ سَائِرَ جَسَدِهِ. [رواه البخاري: ٢٧٢]

**195.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ cunub olduqdan sonra qüsl etdikdə əllərini yuyar və namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı; ondan sonra qüsl edərdi; sonra (yaş) əli ilə saçlarının dibini ovxalayardı. Nəhayət, (başının) dərisini tam islatdığını yəqin etdikdə üstünə üç dəfə su tökər, sonra da bədəninin qalan hissəsini yuyardı. (əl-Buxari, 272)

## ٩– باب: إِذَا ذَكَرَ فِي الْمَسْجِدِ أَنَّهُ جُنُبٌ يَخْرُجُ كَمَا هُوَ وَلاَ يَتَيَمَّمُ

## 9-cu fəsil. Adam məsciddə ikən cunub olduğunu xatırlasa, təyəmmüm etməyib olduğu halda bayıra çıxmalıdır

**١٩٦ –** عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: أُقِيمَتِ الصَّلاَةُ، وَعُدِّلَتِ الصُّفُوفُ قِيَامًا، فَخَرَجَ إِلَيْنَا رَسُولُ اللَّهِ ﷺ فَلَمَّا قَامَ فِي مُصَلاَّهُ ذَكَرَ أَنَّهُ جُنُبٌ فَقَالَ لَنَا: «مَكَانَكُمْ». ثُمَّ رَجَعَ فَاغْتَسَلَ، ثُمَّ خَرَجَ إِلَيْنَا وَرَأْسُهُ يَقْطُرُ، فَكَبَّرَ فَصَلَّيْنَا مَعَهُ. [رواه البخاري: ٢٧٥]

**196.** Əbu Hureyra ﷺ rəvayət edir ki, namaza (başlamaq üçün) iqamə verildi və cərgələr düzəldi. Peyğəmbər ﷺ bizim yanımıza gəlib namaza durduqda cunub olduğunu xatırladı. O (bizə): "Yerinizdən tərpənməyin!"– dedi və (evinə) qayıdıb qüsl etdi. Sonra o, başından su damcılaya-damcılaya yanımıza gəlib təkbir gətirdi[1] və biz onunla birlikdə namaz qıldıq. (əl-Buxari, 275)

## 10-cu fəsil. Xəlvətə çəkilib təklikdə, çılpaq çimən kimsə

## ١٠– باب: مَنِ اغْتَسَلَ عُرْيَانًا وَحْدَهُ فِى الْخَلْوَةِ

١٩٧ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «كَانَتْ بَنُو إِسْرَائِيلَ يَغْتَسِلُونَ عُرَاةً، يَنْظُرُ بَعْضُهُمْ إِلَى بَعْضٍ، وَكَانَ مُوسَى يَغْتَسِلُ وَحْدَهُ، فَقَالُوا وَاللَّهِ مَا يَمْنَعُ مُوسَى أَنْ يَغْتَسِلَ مَعَنَا إِلاَّ أَنَّهُ آدَرُ، فَذَهَبَ مَرَّةً يَغْتَسِلُ، فَوَضَعَ ثَوْبَهُ عَلَى حَجَرٍ، فَفَرَّ الْحَجَرُ بِثَوْبِهِ، فَخَرَجَ مُوسَى فِى إِثْرِهِ يَقُولُ ثَوْبِى يَا حَجَرُ. حَتَّى نَظَرَتْ بَنُو إِسْرَائِيلَ إِلَى مُوسَى، فَقَالُوا وَاللَّهِ مَا بِمُوسَى مِنْ بَأْسٍ. وَأَخَذَ ثَوْبَهُ، فَطَفِقَ بِالْحَجَرِ ضَرْبًا». فَقَالَ أَبُو هُرَيْرَةَ وَاللَّهِ إِنَّهُ لَنَدَبٌ بِالْحَجَرِ سِتَّةٌ أَوْ سَبْعَةٌ ضَرْبًا بِالْحَجَرِ. [رواه البخاري: ٢٧٨]

**197.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İsrail oğulları çılpaq olaraq, bir-birilərinə baxa-baxa çimirdilər. Musa isə təklikdə çimərdi. (İsrail oğulları): "Musaya bizimlə birlikdə çimməyə mane olan, ancaq onun dəbə[2] olmasıdır"– dedilər. Bir dəfə Musa çimməyə getdi və paltarını daşın üstünə qoydu. Birdən daş onun paltarını götürüb qaçdı. Musa: "Paltarımı (qaytar), ey daş!" deyə-deyə daşın arxasınca qaçdı. Nəhayət, İsrail oğulları Musanı çılpaq gördülər və: "Allaha and olsun ki, Musada heç bir qüsur yox imiş"– dedilər. Musa paltarını götürdü və daşı vurmağa başladı.

Əbu Hureyra dedi: "Vallahi, Musa daşa altı yaxud yeddi zərbə vurmaqla daşı tənbeh etdi." (əl-Buxari, 278)

١٩٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «بَيْنَا أَيُّوبُ يَغْتَسِلُ عُرْيَانًا فَخَرَّ عَلَيْهِ جَرَادٌ مِنْ ذَهَبٍ، فَجَعَلَ أَيُّوبُ يَحْتَثِى فِى ثَوْبِهِ، فَنَادَاهُ رَبُّهُ يَا أَيُّوبُ، أَلَمْ أَكُنْ أَغْنَيْتُكَ عَمَّا تَرَى قَالَ بَلَى وَعِزَّتِكَ وَلَكِنْ لاَ غِنَى بِى عَنْ بَرَكَتِكَ». [رواه البخاري: ٢٧٩]

**198.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əyyub çılpaq çimərkən onun üstünə qızıldan çəyirtkələr töküldü. Əyyub (onları) paltarının (cibinə) yığmağa başladı. (Bu vaxt) Rəbbi onu çağırıb: "Ey Əyyub! Məgər Mən səni bu gördüyündən (də artığı ilə) zəngin etmədimmi?"– deyə buyurdu. Əyyub: "Bəli, Sənin izzətinə and olsun ki, (elədir). Lakin mən (hər zaman) Sənin bərəkətinə möhtacam"– deyə cavab verdi. (əl-Buxari, 279)

## 11-ci fəsil. İnsanların yanında qüsl etdikdə pərdə tutmaq

## ١١– باب: التَّسَتُّرُ فِى الْغُسْلِ عِنْدَ النَّاسِ

١٩٩ – عَنْ أُمِّ هَانِئٍ بِنْتَ أَبِى طَالِبٍ ﷺ قَالَتْ: ذَهَبْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ عَامَ الْفَتْحِ، فَوَجَدْتُهُ يَغْتَسِلُ وَفَاطِمَةُ تَسْتُرُهُ فَقَالَ: «مَنْ هَذِهِ». فَقُلْتُ أَنَا أُمُّ هَانِئٍ. [رواه البخاري: ٢٨٠]

---

[1] "Allahu Əkbər" deyib namaza başlamaq.

[2] Dəbə – qasıq yırtığı xəstəliyinə və ya bu cür xəstəliyi olan adama deyilir. Buna qrıja da deyirlər.

**199.** Ummu Hani bint Əbu Talib ﵂ rəvayət edir ki, mən (Məkkənin) fəthi ilində Peyğəmbərin ﷺ yanına getdim və onun qüsl etdyini, Fatimənin ﵂ də pərdə tutduğunu gördüm. Peyğəmbər ﷺ: "Kimdir bu (qadın)?"– deyə soruşdu. "Mənəm, Ummu Hani"– deyə cavab verdim. (əl-Buxari, 280)

## 12-ci fəsil. Mömin murdar olmaz

## ١٢– باب: الْمُؤْمِنُ لاَ يَنْجُسُ

**٢٠٠** – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ أَنَّ النَّبِىَّ ﷺ لَقِيَهُ فِى بَعْضِ طَرِيقِ الْمَدِينَةِ وَهْوَ جُنُبٌ، فَانْخَنَسْتُ مِنْهُ، فَذَهَبَ فَاغْتَسَلَ، ثُمَّ جَاءَ فَقَالَ: «أَيْنَ كُنْتَ يَا أَبَا هُرَيْرَةَ». قَالَ: كُنْتُ جُنُبًا، فَكَرِهْتُ أَنْ أُجَالِسَكَ وَأَنَا عَلَى غَيْرِ طَهَارَةٍ. فَقَالَ: «سُبْحَانَ اللَّهِ، إِنَّ الْمُؤْمِنَ لاَ يَنْجُسُ». [رواه البخاري: ٢٨٣]

**200.** Əbu Hureyra ﵁ rəvayət edir ki, bir gün o, cənabətli olduğu halda Mədinənin küçələrindən birində Peyğəmbərlə ﷺ rastlaşdı. Peyğəmbərdən ﷺ aralanıb getdi, sonra da qüsl alıb geri qayıtdı. Peyğəmbər ﷺ: "Harada idin, ey Əbu Hureyra?"– deyə soruşdu. (Əbu Hureyra): "Cənabətli idim. Odur ki, təmiz olmadığım halda sənin yanında oturmaq istəmədim"– deyə cavab verdi. Peyğəmbər ﷺ: "Subhanəllah! Mömin murdar olmaz"– dedi. (əl-Buxari, 283)

## 13-cü fəsil. Cunub olan kimsənin dəstəmaz alıb yatması

## ١٣– باب: مَبِيتُ الْجُنُبِ إِذَا تَوَضَّأَ...

**٢٠١** – عَنْ عُمَرَ بْنَ الْخَطَّابِ ﵁: سَأَلَ رَسُولَ اللَّهِ ﷺ أَيَرْقُدُ أَحَدُنَا وَهْوَ جُنُبٌ؟ قَالَ: «نَعَمْ إِذَا تَوَضَّأَ أَحَدُكُمْ فَلْيَرْقُدْ وَهُوَ جُنُبٌ». [رواه البخاري: ٢٨٧]

**201.** Rəvayət edilir ki, Ömər ibn Xəttab ﵁ Peyğəmbərdən: "Bizdən birimiz cunub olduğu halda yata bilərmi?"– deyə soruşdu. O dedi: "Bəli! Əgər sizdən biriniz cunub olduğu halda dəstəmaz alsa, yata bilər." (əl-Buxari, 287)

## 14-cü fəsil. (Kişi və qadının) cinsiyyət üzvləri bir-birinə toxunarsa

## ١٤– باب: إِذَا الْتَقَى الْخِتَانَانِ

**٢٠٢** – عَنْ أَبِي هُرَيْرَةَ ﵁، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «إِذَا جَلَسَ بَيْنَ شُعَبِهَا الأَرْبَعِ ثُمَّ جَهَدَهَا، فَقَدْ وَجَبَ الْغَسْلُ». [رواه البخاري: ٢٩١]

**202.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Kişi) qadının dörd əzası[1] arasında oturub onunla cinsi əlaqəyə girərsə, (hər ikisinə) qüsl etmək vacib olar." (əl-Buxari, 291)

---

[1] Burada dörd əza deyildikdə ya qadının ayaqları və əlləri, ya da cinsiyyət üzvünün sağ və col tərəfləri qəsd edilir.

# ٦ – كِتَابُ الحَيْضِ

# 6 – Heyz kitabı

## 1-ci fəsil. Heyz[1] olan qadınlara əmr etmək

## ١– باب: الأَمْرُ بِالنُّفَسَاءِ إِذَا نُفِسْنَ

٢٠٣ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: خَرَجْنَا لاَ نَرَى إِلاَّ الْحَجَّ، فَلَمَّا كُنَّا بسَرِفَ حضْتُ ، فَدَخَلَ عَلَيَّ رَسُولُ اللَّه ﷺ وَأَنَا أَبْكِى، قَالَ: «مَا لَك أَنُفِسْتِ؟». قُلْتُ نَعَمْ. قَالَ: «إِنَّ هَذَا أَمْرٌ كَتَبَهُ اللَّهُ عَلَى بَنَاتِ آدَمَ، فَاقْضِى مَا يَقْضِى الْحَاجُّ، غَيْرَ أَنْ لاَ تَطُوفِى بِالْبَيْتِ». [رواه البخاري: ٢٩٤]

**203.** Aişə رضي الله عنها rəvayət edir ki, biz həcc ziyarətini yerinə yetirmək məqsədilə yola çıxdıq. (Nəhayət,) gəlib Sərifə[2] çatdıqda mən heyz oldum. Peyğəmbər ﷺ mənim yanıma girib ağladığımı gördü və: "Sənə nə olub? Yoxsa heyz olmusan?"– deyə soruşdu. Mən: "Bəli!"– deyə cavab verdim. O dedi: "Bu, Allahın Adəm qızları üçün əzəldən müəyyən etdiyi bir işdir. Buna görə də sən, hacıların yerinə yetirdiyi (həcc əməllərinin hamısını) yerinə yetir. Yalnız Kəbəni təvaf etməkdən başqa." (əl-Buxari, 294)

## 2-ci fəsil. Heyzli qadının ərinin başını yuması və (saçlarını) daraması

## ٢– باب: غَسْلُ الْحَائِضِ رَأْسَ زَوْجِهَا وَتَرْجِيلِه

٢٠٤ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كُنْتُ أُرَجِّلُ رَأْسَ رَسُولِ اللَّهِ ﷺ وَأَنَا حَائِضٌ. [رواه البخاري: ٢٩٥]

**204.** Aişə رضي الله عنها rəvayət edir ki, mən heyzli ikən Peyğəmbərin ﷺ başını darayardım. (əl-Buxari, 295)

٢٠٥ – وَ فِي رِوَايَةٍ: وَ هُوَ مُجَاوِرٌ فِى الْمَسْجِدِ، يُدْنِى لَهَا رَأْسَهُ وَهِىَ فِى حُجْرَتِهَا، فَتُرَجِّلُهُ وَهِىَ حَائِضٌ. [رواه البخاري: ٢٩٦]

**205.** Digər rəvayətdə deyilir ki, Peyğəmbər ﷺ də məsciddə (etikaf[3] etdiyi) zaman başını Aişəyə رضي الله عنها tərəf uzadar, o da heyzli olduğu halda və öz hücrəsində ikən onun başını darayardı. (əl-Buxari, 296)

## 3-cü fəsil. Kişinin, zövcəsi heyzli ikən başını onun qucağına qoyub Quran oxuması

## ٣– باب: قِرَاءَةُ الرَّجُلِ فِى حَجْرِ امْرَأَتِهِ وَهِىَ حَائِضٌ

٢٠٦ – عَنْهَا رضي الله عنها أَنَّ النَّبِىَّ ﷺ كَانَ يَتَّكِئُ فِى حَجْرِى وَ أَنَا حَائِضٌ، ثُمَّ يَقْرَأُ الْقُرْآنَ. [رواه البخاري: ٢٩٧]

---

[1] Həddi-büluğa çatmış qızlarda, həmçinin qadınlarda hər ay uşaqlıqdan qan ifrazı halıdır; buna adət, aybaşı da deyirlər.
[2] Məkkənin on bir kilometrliyində yerləşən yerdir.
[3] Ramazanın axır on gününü ibadət məqsədilə məsciddə qalmaq.

**206.** Aişə ﵂ demişdir: “Mən heyzli ikən Peyğəmbər ﷺ başını qucağıma qoyub Quran oxuyardı.” (əl-Buxari, 297)

## ٤– باب: مَنْ سَمَّى النِّفَاسَ حَيْضًا

## 4-cü fəsil. Nifası[1] heyz adlandıran kimsə

٢٠٧ – عَنْ أُمِّ سَلَمَةَ ﵂ قَالَتْ، بَيْنَا أَنَا مَعَ النَّبِيِّ ﷺ مُضْطَجِعَةً فِي خَمِيصَةٍ إِذْ حِضْتُ، فَانْسَلَلْتُ فَأَخَذْتُ ثِيَابَ حِيضَتِي، قَالَ: «أَنُفِسْتِ؟». قُلْتُ نَعَمْ. فَدَعَانِي فَاضْطَجَعْتُ مَعَهُ فِي الْخَمِيلَةِ. [رواه البخاري: ٢٩٨]

**207.** Ummu Sələmə ﵂ rəvayət edir ki, mən Peyğəmbərlə ﷺ bərabər (üzərində naxışlar olan) bir əbaya bürünüb uzandığım zaman birdən heyz oldum. Mən yavaşca qalxıb heyz paltarımı götürdüm. (Paltarımı geyindikdən sonra) Peyğəmbər ﷺ: “Olmaya heyz gördün?”– deyə soruşdu. Mən: “Bəli!”– deyə cavab verdim. O, məni yanına çağırdı və mən onunla birlikdə əbaya bürünüb yatdım. (əl-Buxari, 298)

## ٥– باب: مُبَاشَرَةُ الْحَائِضِ

## 5-ci fəsil. Heyzli qadına toxunmaq

٢٠٨ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كُنْتُ أَغْتَسِلُ أَنَا وَالنَّبِيُّ ﷺ مِنْ إِنَاءٍ وَاحِدٍ، كِلاَنَا جُنُبٌ، وَكَانَ يَأْمُرُنِي فَأَتَّزِرُ، فَيُبَاشِرُنِي وَأَنَا حَائِضٌ، وَكَانَ يُخْرِجُ رَأْسَهُ إِلَيَّ وَهُوَ مُعْتَكِفٌ، فَأَغْسِلُهُ وَأَنَا حَائِضٌ. [رواه البخاري: ٢٩٩–٣٠١]

**208.** Aişə ﵂ rəvayət edir ki, mən Peyğəmbərlə ﷺ birlikdə, ikimiz də cunub olduğumuz halda, bir qabdan (su götürüb) qüsl edərdik. Mən heyzli olduqda isə o mənə (ayıb yerlərimə) fitə[2] bağlamağı əmr edər, sonra da əllərini bədənimə toxundurardı.

Peyğəmbər ﷺ (məsciddə) etikafda ikən başını mənə tərəf uzadar və mən heyzli olduğum halda onun başını yuyardım. (əl-Buxari, 299-301)

٢٠٩ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ، كَانَتْ إِحْدَانَا إِذَا كَانَتْ حَائِضًا، فَأَرَادَ رَسُولُ اللَّهِ ﷺ أَنْ يُبَاشِرَهَا، أَمَرَهَا أَنْ تَتَّزِرَ فِي فَوْرِ حَيْضَتِهَا ثُمَّ يُبَاشِرُهَا. قَالَتْ وَأَيُّكُمْ يَمْلِكُ إِرْبَهُ كَمَا كَانَ النَّبِيُّ ﷺ يَمْلِكُ إِرْبَهُ. [رواه البخاري: ٣٠٢]

**209.** Aişə ﵂ rəvayət edir ki, bizdən birimiz heyz olduğu və Peyğəmbər ﷺ ona toxunmaq istədiyi zaman (heyz görmüş zövcəsinə) fitə bağlamağı əmr edər, sonra da əllərini onun bədəninə toxundurardı.

(Aişə ﵂ rəvayətinə davam edib) dedi: “Hansınız öz nəfsini, Peyğəmbər ﷺ öz nəfsini saxladığı kimi saxlaya bilər?” (əl-Buxari, 296)

## ٦– باب: تَرْكُ الْحَائِضِ الصَّوْمَ

## 6-cı fəsil. Heyzli qadının oruc tutmağı tərk etməsi

٢١٠ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﵁ قَالَ، خَرَجَ رَسُولُ اللَّهِ ﷺ فِي أَضْحًى، أَوْ فِطْرٍ إِلَى الْمُصَلَّى، فَمَرَّ عَلَى النِّسَاءِ فَقَالَ: «يَا مَعْشَرَ النِّسَاءِ تَصَدَّقْنَ، فَإِنِّي أُرِيتُكُنَّ أَكْثَرَ أَهْلِ النَّارِ». فَقُلْنَ وَبِمَ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: «تُكْثِرْنَ اللَّعْنَ،

[1] Doğuşdan sonra müəyyən vaxtadək uşaqlıqdan qan ifrazı halı.
[2] Hamamda çimərkən və ya bir iş görərkən belə bağlanan qumaş parça.

وَتَكْفُرْنَ الْعَشِيرَ، مَا رَأَيْتُ مِنْ نَاقِصَاتِ عَقْلٍ وَدِينٍ أَذْهَبَ لِلُبِّ الرَّجُلِ الْحَازِمِ مِنْ إِحْدَاكُنَّ». قُلْنَ وَمَا نُقْصَانُ دِينِنَا وَعَقْلِنَا يَا رَسُولَ اللَّهِ؟ قَالَ: «أَلَيْسَ شَهَادَةُ الْمَرْأَةِ مِثْلَ نِصْفِ شَهَادَةِ الرَّجُلِ». قُلْنَ بَلَى. قَالَ: «فَذَلِكَ مِنْ نُقْصَانِ عَقْلِهَا، أَلَيْسَ إِذَا حَاضَتْ لَمْ تُصَلِّ وَلَمْ تَصُمْ». قُلْنَ بَلَى. قَالَ: «فَذَلِكَ مِنْ نُقْصَانِ دِينِهَا». [رواه البخاري: ٣٠٤]

**210.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ qurban yaxud fitrə bayramında namaz qılınan yerə getdi. Qadınların yanından keçdikdə (dayanıb) belə buyurdu: "Ey qadınlar! Sədəqə verin! Çünki mənə Cəhənnəm əhlinin əksəriyyətinin siz qadınlar olduğu göstərildi." Qadınlar: "Nəyə görə, ya Rəsulullah?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Çünki siz (insanları) tez-tez lənətləyir və ərlərinizə qarşı nankorluq edirsiniz. Mən ağıllı və ehtiyatlı bir adamın sizin qədər həm ağıl, həm də din baxımından nöqsanlı olduğunu görmədim." Qadınlar: "Dinimizdə və ağlımızda olan nöqsan nədir, ya Rəsulullah?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Məgər qadının şahidliyi kişinin şahidliyinin yarısına bərabər deyilmi?" Onlar: "Bəli!"– deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: "Bu, qadının ağlının naqisliyidir. Məgər (qadın) heyz olduğu zaman namazını və orucunu tərk etmirmi?" Onlar: "Bəli!"– deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: "Bu da, onun dininin naqisliyidir." (əl-Buxari, 304)

## 7-ci fəsil. İstihazəli[1] qadının etikaf etməsi

## ٧– باب: الاعْتِكَافُ لِلْمُسْتَحَاضَةِ

٢١١ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ اعْتَكَفَ مَعَهُ بَعْضُ نِسَائِهِ وَهِيَ مُسْتَحَاضَةٌ تَرَى الدَّمَ، فَرُبَّمَا وَضَعَتِ الطَّسْتَ تَحْتَهَا مِنَ الدَّمِ. [رواه البخاري: ٣٠٩]

**211.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbərin ﷺ zövcələrindən bəziləri istihazə qanı gördüyü halda onunla birlikdə etikaf edərdi. Bəzən də qan (yerə bulaşmasın) deyə altına ləyən qoyardı. (əl-Buxari, 309)

## 8-ci fəsil. Heyzdən təmizlənmiş qadının qüsl edərkən ətirlənməsi

## ٨– باب: الطِّيبُ لِلْمَرْأَةِ عِنْدَ غُسْلِهَا مِنَ الْمَحِيضِ

٢١٢ – عَنْ أُمِّ عَطِيَّةَ رضي الله عنها قَالَتْ كُنَّا نُنْهَى أَنْ نُحِدَّ عَلَى مَيِّتٍ فَوْقَ ثَلاَثٍ، إِلاَّ عَلَى زَوْجٍ أَرْبَعَةَ أَشْهُرٍ وَعَشْرًا، وَلاَ نَكْتَحِلَ وَلاَ نَتَطَيَّبَ وَلاَ نَلْبَسَ ثَوْبًا مَصْبُوغًا إِلاَّ ثَوْبَ عَصْبٍ، وَقَدْ رُخِّصَ لَنَا عِنْدَ الطُّهْرِ إِذَا اغْتَسَلَتْ إِحْدَانَا مِنْ مَحِيضِهَا فِي نُبْذَةٍ مِنْ كُسْتِ أَظْفَارٍ، وَكُنَّا نُنْهَى عَنِ اتِّبَاعِ الْجَنَائِزِ. [رواه البخاري: ٣١٣]

**212.** Ummu Ətiyyə رضي الله عنها rəvayət edir ki, ölüyə üç gündən artıq yas saxlamaq bizə qadağan edilərdi. Yalnız ər üçün dörd ay on gün yas saxlamaq müstəsna idi. (Bu müddət ərzində) biz nə sürmə çəkər, nə ətirlənər, nə də rəngli paltarlar geyinərdik. Ancaq asbdan (Yəmən bürüncəyindən) başqa. Bizdən birimiz heyzdən

---

[1] Bəzi qadınlarda heyz müddəti bitdikdən sonra uşaqlıqdan qan ifrazı halı.

təmizləndikdən sonra qüsl etmək istədikdə ona "kustu əzfar"dan[1] istifadə etməyə rüsxət verilərdi. Həmçinin, cənazənin ardınca getmək bizə qadağan edilərdi. (əl-Buxari, 313)

## 9-cu fəsil. Qadının, heyzdən təmizlənəcəyi zaman bədənini ovxalaması

## ٩– باب: دَلْكِ الْمَرْأَةِ نَفْسَهَا إِذَا تَطَهَّرَتْ مِنَ الْمَحِيضِ

**٢١٣** – عَنْ عَائِشَةَ ﵂، أَنَّ امْرَأَةً سَأَلَتِ النَّبِىَّ ﷺ عَنْ غُسْلِهَا مِنَ الْمَحِيضِ، فَأَمَرَهَا كَيْفَ تَغْتَسِلُ قَالَ: «خُذِى فِرْصَةً مِنْ مِسْكٍ فَتَطَهَّرِى بِهَا». قَالَتْ: كَيْفَ أَتَطَهَّرُ؟ قَالَ: «تَطَهَّرِى بِهَا». قَالَتْ كَيْفَ؟ قَالَ: «سُبْحَانَ اللَّهِ تَطَهَّرِى». فَاجْتَبَذْتُهَا إِلَىَّ فَقُلْتُ تَتَبَّعِى بِهَا أَثَرَ الدَّمِ. [رواه البخاري: ٣١٤]

**213.** Aişə ﵂ rəvayət edir ki, bir qadın Peyğəmbərdən ﷺ heyzdən sonra yuyunması barədə soruşdu. Peyğəmbər ﷺ ona necə yuyunacağını (başa salıb) buyurdu: "Müşkə batırılmış yun (və ya pambıq) parça götür və onunla təmizlən." (Qadın): "Necə təmizlənim?"– deyə soruşdu. (Peyğəmbər ﷺ): "Onunla təmizlən"– deyə buyurdu. (Qadın yenə): "Axı necə?"– deyə soruşduqda o: "Subhanəllah! Onunla təmizlən"– deyə buyurdu.

Mən o qadını özümə tərəf çəkib: "Onunla qan ləkələri qalmış yerləri silib təmizlə"– dedim. (əl-Buxari, 314)

## 10-cu fəsil. Qadının heyzdən (təmizləndikdən sonra) qüsl etdikdə daranması

## ١٠– باب: امْتِشَاطُ الْمَرْأَةِ عِنْدَ غُسْلِهَا مِنَ الْمَحِيضِ

**٢١٤** – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ، أَهْلَلْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ فِى حَجَّةِ الْوَدَاعِ، فَكُنْتُ مِمَّنْ تَمَتَّعَ، وَلَمْ يَسُقِ الْهَدْىَ، فَزَعَمَتْ أَنَّهَا حَاضَتْ، وَلَمْ تَطْهُرْ حَتَّى دَخَلَتْ لَيْلَةُ عَرَفَةَ فَقَالَتْ يَا رَسُولَ اللَّهِ، هَذِهِ لَيْلَةُ عَرَفَةَ، وَإِنَّمَا كُنْتُ تَمَتَّعْتُ بِعُمْرَةٍ. فَقَالَ لَهَا رَسُولُ اللَّهِ ﷺ «انْقُضِى رَأْسَكِ، وَامْتَشِطِى، وَأَمْسِكِى عَنْ عُمْرَتِكِ». فَفَعَلْتُ، فَلَمَّا قَضَيْتُ الْحَجَّ أَمَرَ عَبْدَ الرَّحْمَنِ لَيْلَةَ الْحَصْبَةِ فَأَعْمَرَنِى مِنَ التَّنْعِيمِ مَكَانَ عُمْرَتِى الَّتِى نَسَكْتُ. [رواه البخاري: ٣١٦]

**214.** Aişə ﵂ rəvayət edir ki, mən vida həccində Peyğəmbərlə ﷺ birlikdə niyyət edib ihrama girdim. Mən təməttu həccinə[2] niyyət edib özü ilə qurbanlıq heyvanı sürüb gətirməyən kimsələrdən idim.

(Ravi deyir ki,) Aişə ﵂ heyz olduğunu və Ərəfa gecəsi yetişincəyə qədər təmizlənmədiyini söylədi. (Aişə ﵂) dedi: "Ya Rəsulullah! Bu, Ərəfa gecəsidir. Mən isə ancaq ümrə niyyəti ilə ihrama girmişdim." Rəsulullah ﷺ ona: "Saçlarını aç, daran və ümrəni sonraya saxla"– deyə buyurdu.

(Aişə ﵂) dedi: "Mən (onun dediyini) yerinə yetirdim. Mən həcc ziyarətini başa vurduqdan sonra Mühəssəbdə[3] olduğumuz gecə Peyğəmbər ﷺ (qardaşım)

---

[1] "Burada "kustu əzfar" deyildikdə buxur nəzərdə tutulur. Buxur, yandırıldıqda ətir saçan qatrandır.
[2] Həcc kitabına bax.
[3] Mina vadisinin yaxınlığındakı yer adıdır.

Abdur-Rəhmana ﷺ məni Tən'imə[1] aparmağı əmr etdi və mən (yenidən) ümrə niyyəti ilə ihrama girdim." (əl-Buxari, 316)

## 11-ci fəsil. Qadının, heyzdən (təmizləndikdən sonra) qüsl etdikdə saçlarını açması

## ١١– باب: نَقْضُ الْمَرْأَةِ شَعَرَهَا عِنْدَ غُسْلِ الْمَحِيضِ

٢١٥ – وَعَنْهَا ﵂ قَالَتْ: خَرَجْنَا مُوَافِينَ لِهِلاَلِ ذِى الْحِجَّةِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ «مَنْ أَحَبَّ أَنْ يُهِلَّ بِعُمْرَةٍ فَلْيُهْلِلْ، فَإِنِّى لَوْلاَ أَنِّى أَهْدَيْتُ لأَهْلَلْتُ بِعُمْرَةٍ». فَأَهَلَّ بَعْضُهُمْ بِعُمْرَةٍ، وَأَهَلَّ بَعْضُهُمْ بِحَجٍّ، وَكُنْتُ أَنَا مِمَّنْ أَهَلَّ بِعُمْرَةٍ، فَأَدْرَكَنِى يَوْمُ عَرَفَةَ وَأَنَا حَائِضٌ، فَشَكَوْتُ إِلَى النَّبِىِّ ﷺ فَقَالَ: «دَعِى عُمْرَتَكِ، وَانْقُضِى رَأْسَكِ وَامْتَشِطِى، وَأَهِلِّى بِحَجٍّ». فَفَعَلْتُ حَتَّى إِذَا كَانَ لَيْلَةُ الْحَصْبَةِ أَرْسَلَ مَعِى أَخِى عَبْدَ الرَّحْمَنِ بْنَ أَبِى بَكْرٍ، فَخَرَجْتُ إِلَى التَّنْعِيمِ، فَأَهْلَلْتُ بِعُمْرَةٍ مَكَانَ عُمْرَتِى. قَالَ هِشَامٌ وَلَمْ يَكُنْ فِى شَىْءٍ مِنْ ذَلِكَ هَدْىٌ وَلاَ صَوْمٌ وَلاَ صَدَقَةٌ. [رواه البخاري: ٣١٧]

**215.** Aişə ﵂ rəvayət edir ki, biz (həcc ziyarətini yerinə yetirmək üçün) zülhiccənin birinci günü yola çıxdıq. (Nəhayət,) Rəsulullah ﷺ dedi: "Kim ümrə niyyəti ilə ihrama girmək istəyirsə, qoy (istədiyi kimi) ihrama girsin. Əgər qurbanlıq heyvanı özümlə gətirməsəydim, mən də ümrə niyyəti ilə ihrama girərdim." (Beləliklə də) kimisi ümrə niyyəti ilə, kimisi də həcc niyyəti ilə ihrama girdi. Mən ümrə niyyəti ilə ihrama girən kimsələrdən idim. Ərəfa günü gəlib yetişdikdə mən heyzli idim. Odur ki, Peyğəmbərə ﷺ şikayət etdim. O: "Ümrəni sonraya saxla, saçlarını aç, daran və həcc niyyəti ilə ihrama gir"– deyə buyurdu. Mən (onun dediyini) yerinə yetirdim. Nəhayət, Mühəssəbdə olduğumuz gecə Peyğəmbər ﷺ qardaşım Abdur-Rəhman ibn Əbu Bəkri mənimlə göndərdi. Mən Tən'imə gəlib əvvəlki ümrəmin əvəzinə yenidən ümrə niyyəti ilə ihrama girdim.

Hişam dedi: "Buna görə (kəffarə olaraq) nə qurban kəsmək, nə oruc tutmaq, nə də sədəqə vermək lazım gəldi." (əl-Buxari, 317)

## 12-ci fəsil. Heyzli qadın buraxdığı namazları qılmamalıdır

## ١٢– باب: لاَ تَقْضِى الْحَائِضُ الصَّلاَةَ

٢١٦ – وَعَنْهَا ﵂، أَنَّ امْرَأَةً قَالَتْ: أَتَجْزِى إِحْدَانَا صَلاَتَهَا إِذَا طَهُرَتْ؟ فَقَالَتْ أَحَرُورِيَّةٌ أَنْتِ؟ كُنَّا نَحِيضُ مَعَ النَّبِىِّ ﷺ فَلاَ يَأْمُرُنَا بِهِ، أَوْ قَالَتْ فَلاَ نَفْعَلُهُ. [رواه البخاري: ٣٢١]

**216.** Aişədən ﵂ rəvayət edilir ki, bir qadın (ondan): "Bizdən birimiz heyzdən təmizləndikdən sonra (heyz vaxtı buraxdığı namazları) qılmalıdırmı?"– deyə soruşdu. Aişə dedi: "Sən hərurilərdənsən?![2] Biz Peyğəmbərin ﷺ vaxtında heyz

---

[1] Məkkə əhlinin ihrama girərkən niyyət etdiyi yerdir.

[2] Hərura – Kufə şəhərinin yaxınlığında yerləşən kənddir. Əli ibn Əbu Talibdən ﵁ üz döndərib camaatdan ayrılmış on iki min xəvaric də məhz bu kənddə toplaşmış və camaata qarşı çıxmışlar. Onlar belə hesab edirdilər ki, heyzdən təmizlənmiş qadın heyz əsnasında buraxdığı namazlarını yenidən qılmalıdır.

olurduq, lakin o bizə (buraxdığımız namazları) qılmağı əmr etməzdi yaxud biz (o namazları) qılmazdıq." (əl-Buxari, 321)

## 13-cü fəsil. Paltarını geymiş heyzli qadınla bir yataqda yatmaq

## ١٣– باب: النَّوْمُ مَعَ الْحَائِضِ وَهِىَ فِى ثِيَابِهَا

٢١٧ – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها قَالَتْ حِضْتُ وَأَنَا مَعَ النَّبِيِّ ﷺ فِى الْخَمِيلَةِ، فَانْسَلَلْتُ فَخَرَجْتُ مِنْهَا، فَأَخَذْتُ ثِيَابَ حِيضَتِى فَلَبِسْتُهَا، فَقَالَ لِى رَسُولُ اللَّهِ ﷺ: «أَنُفِسْتِ»، قُلْتُ نَعَمْ، فَدَعَانِى فَأَدْخَلَنِى مَعَهُ فِى الْخَمِيلَةِ. وَعَنْهَا أَنَّ النَّبِيَّ ﷺ كَانَ يُقَبِّلُهَا وَهُوَ صَائِمٌ. [رواه البخاري: ٣٢٢]

**217.** Rəvayət edilir ki, Ummu Sələmə رضي الله عنها demişdir: "Mən Peyğəmbərlə ﷺ birlikdə bir bürüncəyə bürünüb uzandığım zaman heyz oldum. Sonra sakitcə bürüncəyin altından çıxdım və heyz paltarımı götürüb geyindim. (Paltarımı geyinəndən sonra) Peyğəmbər ﷺ məndən: "Heyz olmusan?"– deyə soruşdu. Mən: "Bəli"– deyə cavab verdim. Onda o, məni yanına çağırıb bürüncəyin altına aldı.

Ummu Sələmə رضي الله عنها rəvayət etmişdir ki, Peyğəmbər ﷺ oruc tutduğu halda onu öpərdi." (əl-Buxari, 322)

## 14-cü fəsil. Heyzli qadınların (qurban və fitrə) bayramlarında iştirak etməsi

## ١٤– باب: شُهُودُ الْحَائِضِ الْعِيدَيْنِ

٢١٨ – عَنْ أُمِّ عَطِيَّةَ رضي الله عنها قَالَتْ: سَمِعْتُ رَسُولَ اللهِ ﷺ يَقُولُ: «تَخْرُجُ الْعَوَاتِقُ وَذَوَاتُ الْخُدُورِ، أَوِ الْعَوَاتِقُ ذَوَاتُ الْخُدُورِ وَالْحُيَّضُ، وَلْيَشْهَدْنَ الْخَيْرَ وَدَعْوَةَ الْمُؤْمِنِينَ، وَيَعْتَزِلُ الْحُيَّضُ الْمُصَلَّى». قِيلَ لَهَا: الْحُيَّضُ؟ فَقَالَتْ: أَلَيْسَ تَشْهَدُ عَرَفَةَ وَكَذَا وَكَذَا [رواه البخاري: ٣٢٤]

**218.** Ummu Ətiyyə رضي الله عنها rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Qoy gənc qızlar və pərdə arxasında oturanlar (və ya pərdə arxasında oturan gənc qızlar) və heyzli qadınlar (evlərindən) bayıra çıxıb xeyirxah işlərdə və möminlərin (Allaha etdikləri) dualarında iştirak etsinlər. Qoy heyzli qadınlar namaz qılınan yerdən kənar dursunlar." Ummu Ətiyyədən: "Heyzli qadınlar?"– deyə soruşdular. O dedi: "Məgər (onlar) Ərəfatda və filan, filan yerlərdə iştirak etmirlərmi?!" (əl-Buxari, 324)

## 15-ci fəsil. Heyz günlərindən başqa (bir gündə qadının gördüyü) sarı və ya bulanıq su

## ١٥– باب: الصُّفْرَةُ وَ الْكُدْرَةِ فِى غَيْرِ أَيَّامِ الْحَيْض

٢١٩ – عَنْ أُمِّ عَطِيَّةَ رضي الله عنها قَالَتْ: كُنَّا لاَ نَعُدُّ الْكُدْرَةَ وَالصُّفْرَةَ شَيْئًا. [رواه البخاري: ٣٢٦]

**219.** Ummu Ətiyyə ﵂ belə rəvayət etmişdir: “Biz (heyzdən sonra gördüyümüz) sarı rəngli və ya bulanıq mayeni heyzdən hesab etməzdik.” (əl-Buxari, 326)

## 16-cı fəsil. İfadə təvafından[1] sonra heyz görmüş qadın

## ١٦– باب: الْمَرْأَةُ تَحِيضُ بَعْدَ الإِفَاضَةِ

٢٢٠ – عَنْ عَائِشَةَ ﵂ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّهَا قَالَتْ لِرَسُولِ اللَّهِ ﷺ: يَا رَسُولَ اللَّهِ، إِنَّ صَفِيَّةَ بِنْتَ حُيَيٍّ قَدْ حَاضَتْ؟ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لَعَلَّهَا تَحْبِسُنَا، أَلَمْ تَكُنْ طَافَتْ مَعَكُنَّ؟» فَقَالُوا: بَلَى، قَالَ: «فَاخْرُجِي». [رواه البخاري: ٣٢٨]

**220.** Peyğəmbərin ﷺ zövcəsi Aişədən ﵂ rəvayət edilir ki, o, Peyğəmbərə ﷺ: “Ya Rəsulullah, Səfiyyə bint Huyey heyz oldu”– deyə xəbər verdi. Peyğəmbər ﷺ: “O, bizi ləngidə bilər. Məgər o, sizinlə bərabər təvaf etmədimi?”– dedi. Onlar: “Bəli”– deyə cavab verdilər. Peyğəmbər ﷺ: “Elə isə çıx!”– deyə buyurdu. (əl-Buxari, 328)

## 17-ci fəsil. (Uşaq) doğarkən ölmüş qadının cənazə namazını sünnəyə uyğun şəkildə qılmaq

## ١٧– باب: الصَّلاَةُ عَلَى النُّفَسَاءِ وَسُنَّتُهَا

٢٢١ – عَنْ سَمُرَةَ بْنِ جُنْدُبٍ ﵁: أَنَّ امْرَأَةً مَاتَتْ فِي بَطْنٍ، فَصَلَّى عَلَيْهَا النَّبِيُّ ﷺ فَقَامَ وَسَطَهَا. [رواه البخاري: ٣٣٢]

**221.** Səmura ibn Cundəb ﵁ rəvayət edir ki, bir qadın (uşaq) doğarkən vəfat etdi. Peyğəmbər ﷺ qadının (cənazəsinin) orta nahiyəsində dayanıb onun cənazə namazını qıldı. (əl-Buxari, 332)

## 18-ci fəsil.

## ١٨– «باب»

٢٢٢ – عَنْ مَيْمُونَةَ ﵂ – زَوْجِ النَّبِيِّ ﷺ: أَنَّهَا كَانَتْ تَكُونُ حَائِضًا لاَ تُصَلِّي، وَهِيَ مُفْتَرِشَةٌ بِحِذَاءِ مَسْجِدِ النَّبِيِّ ﷺ، وَهُوَ يُصَلِّي عَلَى خُمْرَتِهِ، إِذَا سَجَدَ أَصَابَهَا بَعْضُ ثَوْبِهِ. [رواه البخاري: ٣٣٣]

**222.** Peyğəmbərin ﷺ zövcəsi Meymunə ﵂ rəvayət edir ki, o, heyzli olduqda namaz qılmaz və Peyğəmbərin ﷺ namaz qıldığı yerə yaxın bir yerdə uzanardı. Peyğəmbər ﷺ səccadəsinin üzərində namaz qılarkən səcdə etdikdə paltarının ucu Meymunəyə toxunardı. (əl-Buxari, 333)

[1] Həcc kitabına bax.

# ٧ – كِتَابُ التَّيَمُّمِ

# 7 – Təyəmmüm kitabı

## ١– باب قوله تعالى:

﴿فَلَمْ تَجِدُوا مَاءً فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا فَامْسَحُوا بِوُجُوهِكُمْ وَأَيْدِيكُمْ مِنْهُ﴾

## 1-ci fəsil. Uca Allahın: «...su tapmasanız, təmiz torpaqla təyəmmüm[1] edin və ondan üzünüzə və əllərinizə sürtün»[2]– sözü

٢٢٣ – عَنْ عَائِشَةَ ﵂، زَوْجِ النَّبِيِّ ﷺ قَالَتْ: خَرَجْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ فِي بَعْضِ أَسْفَارِهِ، حَتَّى إِذَا كُنَّا بِالْبَيْدَاءِ، أَوْ بِذَاتِ الْجَيْشِ، انْقَطَعَ عِقْدٌ لِي، فَأَقَامَ رَسُولُ اللَّهِ ﷺ عَلَى الْتِمَاسِهِ، وَأَقَامَ النَّاسُ مَعَهُ، وَلَيْسُوا عَلَى مَاءٍ، فَأَتَى النَّاسُ إِلَى أَبِي بَكْرٍ الصِّدِّيقِ، فَقَالُوا: أَلاَ تَرَى مَا صَنَعَتْ عَائِشَةُ؟ أَقَامَتْ بِرَسُولِ اللَّهِ ﷺ وَالنَّاسِ، وَلَيْسُوا عَلَى مَاءٍ، وَلَيْسَ مَعَهُمْ مَاءٌ. فَجَاءَ أَبُو بَكْرٍ، وَرَسُولُ اللَّهِ ﷺ وَاضِعٌ رَأْسَهُ عَلَى فَخِذِي قَدْ نَامَ، فَقَالَ: حَبَسْتِ رَسُولَ اللَّهِ ﷺ وَالنَّاسَ، وَلَيْسُوا عَلَى مَاءٍ، وَلَيْسَ مَعَهُمْ مَاءٌ. فَقَالَتْ عَائِشَةُ: فَعَاتَبَنِي أَبُو بَكْرٍ، وَقَالَ مَا شَاءَ اللَّهُ أَنْ يَقُولَ، وَجَعَلَ يَطْعُنُنِي بِيَدِهِ فِي خَاصِرَتِي، فَلاَ يَمْنَعُنِي مِنَ التَّحَرُّكِ إِلاَّ مَكَانُ رَسُولِ اللَّهِ ﷺ عَلَى فَخِذِي، فَقَامَ رَسُولُ اللَّهِ ﷺ حِينَ أَصْبَحَ عَلَى غَيْرِ مَاءٍ، فَأَنْزَلَ اللَّهُ آيَةَ التَّيَمُّمِ فَتَيَمَّمُوا. فَقَالَ أُسَيْدُ بْنُ الْحُضَيْرِ: مَا هِيَ بِأَوَّلِ بَرَكَتِكُمْ يَا آلَ أَبِي بَكْرٍ، قَالَتْ: فَبَعَثْنَا الْبَعِيرَ الَّذِي كُنْتُ عَلَيْهِ، فَأَصَبْنَا الْعِقْدَ تَحْتَهُ. [رواه البخاري: ٣٣٤]

**223.** Peyğəmbərin ﷺ zövcəsi Aişə ﵂ rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxdıq. Nəhayət, Beyda və ya Zətul Ceyş deyilən yerə çatdıqda boyunbağım qırılıb yerə düşdü. Peyğəmbər ﷺ dayanıb onu axtarmağa başladı. Onun yanında olanlar da dayanmağa məcbur oldular. Ətrafda su olmadığından əshabələrdən bəziləri Əbu Bəkr əs-Siddiqin yanına gəlib dedilər: "Aişənin nə etdiyini görürsənmi? Allahın elçisi və bu qədər camaat ona görə dayanıb. Onlarda olan su ehtiyatı qurtarıb, özləri də su olmayan yerdə dayanıblar." Əbu Bəkr (mənim yanıma) gəldi. Bu vaxt Peyğəmbər ﷺ başını dizimin üstünə qoyub yatmışdı. Əbu Bəkr dedi: "Allahın elçisini və bu qədər camaatı su olmayan bir yerdə, həm də su ehtiyatları olmadığı halda saxlamısan?" Sonra o, barmağı ilə böyrümdən vura-vura məni bir az da tənbeh etdi. Bu vaxt Peyğəmbərin ﷺ başı dizimin üstündə olduğuna görə mən tərpənmədim. Peyğəmbər ﷺ ayıldıqda (paklanıb namaz qılmaq üçün) su tapmadı. (Elə bu səbəbdən də) Uca Allah təyəmmüm ayəsini nazil etdi və onlar da təyəmmüm etdilər.

Useyd ibn Xudeyr dedi: "Ey Əbu Bəkrin ailəsi! Bu sizin ilk bərəkətiniz deyildir."

(Aişə ﵂) dedi: "Sonra üstündə oturduğum dəvəni qaldırdıq və boyunbağını onun altından tapdıq." (əl-Buxari, 334)

٢٢٤ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵄: أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «أُعْطِيتُ خَمْسًا، لَمْ يُعْطَهُنَّ أَحَدٌ قَبْلِي: نُصِرْتُ بِالرُّعْبِ مَسِيرَةَ شَهْرٍ، وَجُعِلَتْ لِيَ الأَرْضُ مَسْجِدًا وَطَهُورًا، فَأَيُّمَا رَجُلٍ مِنْ أُمَّتِي أَدْرَكَتْهُ الصَّلاَةُ فَلْيُصَلِّ، وَأُحِلَّتْ لِيَ

---

[1] Lüğəti mənada qəsd etmək, yönəlmək mənası verir, istilahi mənada isə təmiz torpağa qəsd edib onu üzə və əllərə sürtməkdir.

[2] "əl-Maidə" surəsi, 6.

الْمَغَانِمُ وَلَمْ تَحِلَّ لأَحَدٍ قَبْلِي، وَأُعْطِيتُ الشَّفَاعَةَ، وَكَانَ النَّبِيُّ يُبْعَثُ إِلَى قَوْمِهِ خَاصَّةً، وَبُعِثْتُ إِلَى النَّاسِ عَامَّةً». [رواه البخاري: ٣٣٥]

**224.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənə beş (xislət) verilib ki, bunlar məndən əvvəl heç bir kəsə verilməmişdir: "Bir ay əvvəl düşmənin qəlbinə qorxu salaraq ona qalib gəlməyim; yer üzünün mənim üçün pak və namazgah olması, belə ki, ümmətimdən olan hər bir kəs istənilən yerdə vaxtı girmiş namazı qılmalıdır; qənimətlərin mənə halal olması, belə ki, bu, məndən qabaq heç bir peyğəmbərə halal olmamışdır; (Qiyamət günü tərifəlayiq məqamda) şəfaət verməyim; və bir də hər bir peyğəmbər yalnız öz qövmünə göndərilərdi, mən isə bütün insanlara göndərilmişəm." (əl-Buxari, 335)

## 2-ci fəsil. Səfərdə olmayan kəs su tapmadıqda və namazın vaxtının çıxacağından ehtiyat etdikdə təyəmmüm etməlidir

## ٢– باب: التَّيَمُّمُ فِي الْحَضَرِ، إِذَا لَمْ يَجِدِ الْمَاءَ، وَخَافَ فَوْتَ الصَّلاَةِ

٢٢٥ – عَنْ أَبِي جُهَيْمِ بْنِ الْحَارِثِ الأَنْصَارِيِّ ﷺ، قَالَ: أَقْبَلَ النَّبِيُّ ﷺ مِنْ نَحْوِ بِئْرِ جَمَلٍ، فَلَقِيَهُ رَجُلٌ فَسَلَّمَ عَلَيْهِ، فَلَمْ يَرُدَّ عَلَيْهِ النَّبِيُّ ﷺ حَتَّى أَقْبَلَ عَلَى الْجِدَارِ، فَمَسَحَ بِوَجْهِهِ وَيَدَيْهِ، ثُمَّ رَدَّ عَلَيْهِ السَّلاَمَ. [رواه البخاري: ٣٣٧]

**225.** Əbu Cuheym ibn Haris əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Bir-Cəməldən[1] gələrkən qarşısına çıxan bir nəfər ona salam verdi, lakin Peyğəmbər ﷺ onun salamını almadı. Nəhayət, divara yaxınlaşdı, (əllərini divara vurub) üzünə və əllərinə sürtdükdən sonra o kimsənin salamını aldı. (əl-Buxari, 337)

## 3-cü fəsil. Təyəmmüm edən adam əllərinin içinə üfürə bilərmi?

## ٣– باب: الْمُتَيَمِّمُ هَلْ يَنْفُخُ فِيهِمَا

٢٢٦ – عَنْ عَمَّارُ بْنُ يَاسِرٍ ﷺ أَنَّهُ قَالَ لِعُمَرَ بْنِ الْخَطَّابِ ﷺ: أَمَا تَذْكُرُ أَنَّا كُنَّا فِي سَفَرٍ أَنَا وَأَنْتَ، فَأَمَّا أَنْتَ فَلَمْ تُصَلِّ، وَأَمَّا أَنَا فَتَمَعَّكْتُ فَصَلَّيْتُ، فَذَكَرْتُ لِلنَّبِيِّ ﷺ فَقَالَ النَّبِيُّ ﷺ «إِنَّمَا كَانَ يَكْفِيكَ هَكَذَا» فَضَرَبَ النَّبِيُّ ﷺ بِكَفَّيْهِ الأَرْضَ، وَنَفَخَ فِيهِمَا ثُمَّ مَسَحَ بِهِمَا وَجْهَهُ وَكَفَّيْهِ. [رواه البخاري: ٣٣٨]

**226.** Əmmar ibn Yasir ﷺ Ömər ibn Xəttaba dedi: "Yadındadırmı? İkimiz səfərdə idik. Sən namaz qılmadın. Mən isə yerə uzanıb o üz-bu üzə çevrilərək bədənimi torpağa sürtdüm, sonra da namazımı qıldım. Mən bunu Peyğəmbərə ﷺ xəbər verdikdə o: "Sənə belə etmək kifayət edərdi"– deyib əllərini yerə vurdu, sonra əllərinin içinə üfürdü, sonra da ovuclarını üzünə və biləyə qədər (əllərinə) sürtdü. (əl-Buxari, 338)

[1] Bir-Cəməl – Mədinəyə yaxın bir yer adıdır.

## ٤– باب: الصَّعِيدُ الطَّيِّبُ وَضُوءُ الْمُسْلِمِ، يَكْفِيهِ مِنَ الْمَاءِ

## 4-cü fəsil. Təmiz torpaq müsəlmanın təmiz olması üçün suyu əvəz edir

٢٢٧ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ الْخُزَاعِي رضي الله عنهما قَالَ: كُنَّا فِى سَفَرٍ مَعَ النَّبِيِّ ﷺ وَإِنَّا أَسْرَيْنَا، حَتَّى كُنَّا فِى آخِرِ اللَّيْلِ، وَقَعْنَا وَقْعَةً وَلاَ وَقْعَةَ أَحْلَى عِنْدَ الْمُسَافِرِ مِنْهَا، فَمَا أَيْقَظَنَا إِلاَّ حَرُّ الشَّمْسِ، وَكَانَ أَوَّلَ مَنِ اسْتَيْقَظَ فُلاَنٌ ثُمَّ فُلاَنٌ ثُمَّ فُلاَنٌ ثُمَّ عُمَرُ بْنُ الْخَطَّابِ الرَّابِعُ، وَكَانَ النَّبِيُّ ﷺ إِذَا نَامَ لَمْ يُوقَظْ حَتَّى يَكُونَ هُوَ يَسْتَيْقِظُ، لأَنَّا لاَ نَدْرِى مَا يَحْدُثُ لَهُ فِى نَوْمِهِ، فَلَمَّا اسْتَيْقَظَ عُمَرُ، وَرَأَى مَا أَصَابَ النَّاسَ، وَكَانَ رَجُلاً جَلِيدًا، فَكَبَّرَ وَرَفَعَ صَوْتَهُ بِالتَّكْبِيرِ، فَمَا زَالَ يُكَبِّرُ وَيَرْفَعُ صَوْتَهُ بِالتَّكْبِيرِ حَتَّى اسْتَيْقَظَ لِصَوْتِهِ النَّبِيُّ ﷺ فَلَمَّا اسْتَيْقَظَ شَكَوْا إِلَيْهِ الَّذِى أَصَابَهُمْ قَالَ: «لاَ ضَيْرَ – أَوْ لاَ يَضِيرُ – ارْتَحِلُوا». فَارْتَحَلَ فَسَارَ غَيْرَ بَعِيدٍ ثُمَّ نَزَلَ، فَدَعَا بِالْوَضُوءِ، فَتَوَضَّأَ وَنُودِىَ بِالصَّلاَةِ فَصَلَّى بِالنَّاسِ، فَلَمَّا انْفَتَلَ مِنْ صَلاَتِهِ إِذَا هُوَ بِرَجُلٍ مُعْتَزِلٍ لَمْ يُصَلِّ مَعَ الْقَوْمِ قَالَ: «مَا مَنَعَكَ يَا فُلاَنُ أَنْ تُصَلِّىَ مَعَ الْقَوْمِ». قَالَ أَصَابَتْنِى جَنَابَةٌ وَلاَ مَاءَ. قَالَ: «عَلَيْكَ بِالصَّعِيدِ، فَإِنَّهُ يَكْفِيكَ». ثُمَّ سَارَ النَّبِيُّ ﷺ فَاشْتَكَى إِلَيْهِ النَّاسُ مِنَ الْعَطَشِ فَنَزَلَ، فَدَعَا فُلاَنًا وَدَعَا عَلِيًّا فَقَالَ: «اذْهَبَا فَابْتَغِيَا الْمَاءَ». فَانْطَلَقَا فَتَلَقَّيَا امْرَأَةً بَيْنَ مَزَادَتَيْنِ – أَوْ سَطِيحَتَيْنِ – مِنْ مَاءٍ عَلَى بَعِيرٍ لَهَا، فَقَالاَ لَهَا: أَيْنَ الْمَاءُ؟ قَالَتْ: عَهْدِى بِالْمَاءِ أَمْسِ هَذِهِ السَّاعَةَ، وَنَفَرُنَا خُلُوفًا، قَالاَ لَهَا: انْطَلِقِى إِذًا. قَالَتْ إِلَى أَيْنَ؟ قَالاَ: إِلَى رَسُولِ اللَّهِ ﷺ، قَالَت: الَّذِى يُقَالُ لَهُ الصَّابِئُ؟ قَالاَ: هُوَ الَّذِى تَعْنِينَ فَانْطَلِقِى. فَجَاءَا بِهَا إِلَى النَّبِيِّ ﷺ وَحَدَّثَاهُ الْحَدِيثَ، قَالَ: فَاسْتَنْزَلُوهَا عَنْ بَعِيرِهَا، وَدَعَا النَّبِيُّ ﷺ بِإِنَاءٍ، فَفَرَّغَ فِيهِ مِنْ أَفْوَاهِ الْمَزَادَتَيْنِ – أَوِ السَّطِيحَتَيْنِ – وَأَوْكَأَ أَفْوَاهَهُمَا، وَأَطْلَقَ الْعَزَالِىَ، وَنُودِىَ فِى النَّاسِ اسْقُوا وَاسْتَقُوا. فَسَقَى مَنْ شَاءَ، وَاسْتَقَى مَنْ شَاءَ، وَكَانَ آخِرَ ذَاكَ أَنْ أَعْطَى الَّذِى أَصَابَتْهُ الْجَنَابَةُ إِنَاءً مِنْ مَاءٍ قَالَ: «اذْهَبْ، فَأَفْرِغْهُ عَلَيْكَ». وَهِىَ قَائِمَةٌ تَنْظُرُ إِلَى مَا يُفْعَلُ بِمَائِهَا، وَايْمُ اللَّهِ لَقَدْ أُقْلِعَ عَنْهَا، وَإِنَّهُ لَيُخَيَّلُ إِلَيْنَا أَنَّهَا أَشَدُّ مِلأَةً مِنْهَا حِينَ ابْتَدَأَ فِيهَا، فَقَالَ النَّبِيُّ ﷺ: «اجْمَعُوا لَهَا». فَجَمَعُوا لَهَا مِنْ بَيْنِ عَجْوَةٍ وَدَقِيقَةٍ وَسَوِيقَةٍ، حَتَّى جَمَعُوا لَهَا طَعَامًا، فَجَعَلُوهَا فِى ثَوْبٍ، وَحَمَلُوهَا عَلَى بَعِيرِهَا، وَوَضَعُوا الثَّوْبَ بَيْنَ يَدَيْهَا قَالَ لَهَا: «تَعْلَمِينَ مَا رَزِئْنَا مِنْ مَائِكِ شَيْئًا، وَلَكِنَّ اللَّهَ هُوَ الَّذِى أَسْقَانَا». فَأَتَتْ أَهْلَهَا، وَقَدِ احْتَبَسَتْ عَنْهُمْ، قَالُوا: مَا حَبَسَكِ يَا فُلاَنَةُ؟ قَالَتِ الْعَجَبُ، لَقِيَنِى رَجُلاَنِ فَذَهَبَا بِى إِلَى هَذَا الَّذِى يُقَالُ لَهُ الصَّابِئُ، فَفَعَلَ كَذَا وَكَذَا، فَوَاللَّهِ إِنَّهُ لأَسْحَرُ النَّاسِ مِنْ بَيْنِ هَذِهِ وَهَذِهِ. وَقَالَتْ بِإِصْبَعَيْهَا الْوُسْطَى وَالسَّبَّابَةِ، فَرَفَعَتْهُمَا إِلَى السَّمَاءِ – تَعْنِى السَّمَاءَ وَالأَرْضَ – أَوْ إِنَّهُ لَرَسُولُ اللَّهِ حَقًّا. فَكَانَ الْمُسْلِمُونَ بَعْدَ ذَلِكَ يُغِيرُونَ عَلَى مَنْ حَوْلَهَا مِنَ الْمُشْرِكِينَ، وَلاَ يُصِيبُونَ الصِّرْمَ الَّذِى هِىَ مِنْهُ، فَقَالَتْ: يَوْمًا لِقَوْمِهَا مَا أُرَى أَنَّ هَؤُلاَءِ الْقَوْمَ يَدْعُونَكُمْ عَمْدًا، فَهَلْ لَكُمْ فِى الإِسْلاَمِ؟ فَأَطَاعُوهَا فَدَخَلُوا فِى الإِسْلاَمِ. [رواه البخاري: ٣٤٤]

**227.** İmran ibn Husayn əl-Xüzai رضي الله عنهما rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birgə səfərdə ikən bütün gecəni yol getdik. Nəhayət, gecənin axırında yıxılıb yatdıq, müsafir üçün də bundan şirin şey ola bilməz. (Hamımız elə bərk yatmışdıq ki,) bizi yalnız günəşin istisi yuxudan oyatdı. İlk əvvəl filankəs, sonra filankəs, sonra filankəs, sonra da – dördüncü olaraq Ömər ibn Xəttab yuxudan oyandı.

(Adətən) Peyğəmbər ﷺ yatdıqda özü ayılanadək biz onu yuxudan oyatmazdıq. Çünki biz, yuxusunda ona nələr agah olduğunu bilmirdik.

Ömər sərt xasiyyətli bir adam idi. O, yuxudan oyandıqda camaatın başına gələni görüb uca səslə “Allahu Əkbər!” deməyə başladı. O, dayanmadan uca səslə “Allahu Əkbər!” deyirdi. Nəhayət, Peyğəmbər ﷺ onun səsinə oyandı. Yu-

xudan oyandıqda əshabələr başlarına gələni ona bildirdilər. Peyğəmbər ﷺ: "Zərər yoxdur! (Və ya "*bu sizə* zərər verməz!") Yolunuza davam edin"– dedi. Onlar yola düşdülər. Bir az getdikdən sonra Peyğəmbər ﷺ (dəvəsindən) yerə endi və dəstəmaz almaq üçün su istədi. (Peyğəmbər ﷺ) dəstəmaz aldıqdan sonra azan verildi və o, camaata namaz qıldırdı. Namazı bitirdikdən sonra bir nəfərin kənara çəkilib camaatla namaz qılmadığını gördü və: "Sənə camaatla namaz qılmağa nə mane oldu, ey filankəs?"– deyə soruşdu. O: "Mən cunub oldum; su da yoxdur"– deyə cavab verdi. Peyğəmbər ﷺ (ona): "Torpaqdan istifadə et! Bu sənə kifayət edər"– dedi, sonra da yoluna davam etdi. (Bir az getdikdən) sonra insanlar ona susuzluqdan şikayət etdilər. O, (dəvəsindən) yerə endi, sonra da filankəsi və Əlini yanına çağırıb: "Gedin, su axtarın!"– deyə buyurdu. Onlar yola düzəldilər və nəhayət gəlib iki cürdək, yaxud iki tuluq su ilə yüklənmiş dəvəsinin üstündə oturan bir qadına rast gəldilər. Onlar qadından: "Su haradadır?"– deyə soruşdular. Qadın: "Dünən bu vaxtlar mən suyun yanında idim. Bizim adamlar isə arxada qalıblar"– deyə cavab verdi. Onlar: "Elə isə gedək!"– dedilər. Qadın: "Hara?"– deyə soruşdu. Onlar: "Allahın elçisinin ﷺ yanına"– deyə cavab verdilər. Qadın: "Sabii[1] deyilən kimsənin yanınamı?"– deyə soruşdu. Onlar: "(Bəli,) sənin qəsd etdiyin o kimsənin yanına. Haydı gedək!"– dedilər. Onlar qadını Peyğəmbərin ﷺ yanına gətirdilər və (baş vermiş) hadisəni ona danışdılar.

(Ravi) deyir ki, qadını dəvəsindən yerə endirdilər. Peyğəmbər ﷺ bir qab gətizdirdi və cürdəklərin ağızlarını açıb o qaba su boşaltdıqdan sonra onların ağızlarını bağladı. Sonra o, cürdəklərin digər tərəflərindəki ağızlarını açdı və camaata: "Gəlin (heyvanlarınızı) suvarın, (özünüz üçün də) su götürün."– deyildi. Kimisi (heyvanını) suvardı, kimisi də (özü üçün) su götürdü. Axırda Peyğəmbər ﷺ cunub olan kimsəyə bir qab su verib: "Get bunu üstünə tök"– dedi. Qadın isə ayaq üstə durub suyunun necə istifadə edildiyinə tamaşa edirdi. Allaha and olsun ki, o cürdəklərdən su götürməyə son qoyulduqda artıq onlar bizə əvvəlkindən daha dolu görünürdü. Peyğəmbər ﷺ: "Qadın üçün (bir şey) toplayın!"– deyə buyurdu. Onun üçün xurma, un, sıyıq və bir qədər yemək topladıqdan sonra bunları bir torbaya yığdılar. Sonra qadını dəvəsinə mindirdilər və torbanı da onu qucağına qoydular. Peyğəmbər ﷺ qadına dedi: "Bil ki, biz sənin suyundan heç bir şey əksiltmədik. Lakin bizə su verən Allahdır."

Bu səbəbdən qadın öz qəbiləsinə gec gəldi. Onlar: "Səni yoldan saxlayan nə oldu, ey filankəs?"– deyə soruşdular. Qadın dedi: "Əcaib bir şey! Mənə iki nəfər rast gəldi. Onlar məni Sabii deyilən o adamın yanına apardılar. O da belə-belə işlər gördü. Allaha and olsun ki, bu adam – (bu vaxt qadın) orta və şəhadət barmaqlarını göyə qaldırıb göyü və yeri qəsd edərək, – ya bunların arasında (mövcud) olan ən böyük sehrbazdır, ya da Allahın həqiqi elçisidir.

Bundan sonra müsəlmanlar o qadının yaşadığı yerin ətrafındakı müşriklərə hücum etdikdə onun kəndinə toxunmazdılar. Bir gün qadın öz qövmünə: "Güman edirəm ki, bu adamlar sizə bilərəkdən toxunmurlar. İslamı qəbul etmək istəyirsinizmi?"– dedi. Qövmü də ona itaət edib İslama daxil oldu. (əl-Buxari, 344)

---

[1] Sabii – Bir dindən başqa bir dinə meyl edən kimsəyə deyilir.

# ٨ – كِتَابُ الصَّلاةِ

# 8 – Namaz kitabı

## ١– باب: كَيْفَ فُرِضَتِ الصَّلاَةُ فِى الإِسْرَاء

## 1-ci fəsil. Gecə səfərində[1] namazın necə fərz buyrulduğu

٢٢٨ – عَنْ عَنْ أَنَسِ بْنِ مَالِك ﷺ قَالَ: كَانَ أَبُو ذَرٍّ ﷺ يُحَدِّثُ أَنَّ رَسُولَ اللَّه ﷺ قَالَ: «فُرِجَ عَنْ سَقْف بَيْتى وَأَنَا بمَكَّةَ، فَنَزَلَ جبْريلُ فَفَرَجَ صَدْرى، ثُمَّ غَسَلَهُ بمَاء زَمْزَمَ، ثُمَّ جَاءَ بطَسْت منْ ذَهَب مُمْتَلئٍ حكْمَةً وَإِيمَانًا، فَأَفْرَغَهُ فى صَدْرى ثُمَّ أَطْبَقَهُ، ثُمَّ أَخَذَ بيَدى فَعَرَجَ بى إِلَى السَّمَاءِ الدُّنْيَا، فَلَمَّا جئْتُ إِلَى السَّمَاءِ الدُّنْيَا، قَالَ جبْريلُ لخَازنِ السَّمَاء: افْتَحْ، قَالَ: مَنْ هَذَا؟ قَالَ: هَذَا جبْريلُ. قَالَ: هَلْ مَعَكَ أَحَدٌ؟ قَالَ: نَعَمْ مَعى مُحَمَّدٌ ﷺ. فَقَالَ: أُرْسلَ إِلَيْه؟ قَالَ: نَعَمْ. فَلَمَّا فَتَحَ عَلَوْنَا السَّمَاءَ الدُّنْيَا، فَإِذَا رَجُلٌ قَاعدٌ عَلَى يَمينه أَسْوِدَةٌ وَعَلَى يَسَاره أَسْوِدَةٌ، إِذَا نَظَرَ قبَلَ يَمينه ضَحكَ، وَإِذَا نَظَرَ قبَلَ يَسَاره بَكَى، فَقَالَ: مَرْحَبًا بالنَّبىِّ الصَّالح وَالابْنِ الصَّالح. قُلْتُ لجبْريلَ: مَنْ هَذَا؟ قَالَ: هَذَا آدَمُ، وَهَذه الأَسْوِدَةُ عَنْ يَمينه وَشمَاله نَسَمُ بَنيه، فَأَهْلُ الْيَمين منْهُمْ أَهْلُ الْجَنَّة، وَالأَسْوِدَةُ الَّتى عَنْ شمَاله أَهْلُ النَّار، فَإِذَا نَظَرَ عَنْ يَمينه ضَحكَ، وَإِذَا نَظَرَ قبَلَ شمَاله بَكَى، حَتَّى عَرَجَ بى إِلَى السَّمَاء الثَّانيَة، فَقَالَ لخَازنهَا: افْتَحْ. فَقَالَ لَهُ خَازنُهَا مثْلَ مَا قَالَ الأَوَّلُ فَفَتَحَ. قَالَ أَنَسٌ: فَذَكَرَ أَنَّهُ وَجَدَ فى السَّمَوَات آدَمَ وَإِدْريسَ وَمُوسَى وَعيسَى وَإِبْرَاهيمَ صَلَوَاتُ اللَّه عَلَيْهمْ وَلَمْ يُثْبتْ كَيْفَ مَنَازلُهُمْ، غَيْرَ أَنَّهُ ذَكَرَ أَنَّهُ وَجَدَ آدَمَ فى السَّمَاء الدُّنْيَا، وَإِبْرَاهيمَ فى السَّمَاء السَّادسَة. قَالَ أَنَسٌ: فَلَمَّا مَرَّ جبْريلُ بالنَّبىِّ ﷺ بإِدْريسَ قَالَ: مَرْحَبًا بالنَّبىِّ الصَّالح وَالأَخ الصَّالح. فَقُلْتُ: مَنْ هَذَا؟ قَالَ: هَذَا إِدْريسُ. ثُمَّ مَرَرْتُ بمُوسَى، فَقَالَ: مَرْحَبًا بالنَّبىِّ الصَّالح وَالأَخ الصَّالح، قُلْتُ: مَنْ هَذَا؟ قَالَ هَذَا مُوسَى. ثُمَّ مَرَرْتُ بعيسَى، فَقَالَ: مَرْحَبًا بالأَخ الصَّالح وَالنَّبىِّ الصَّالح. قُلْتُ: مَنْ هَذَا؟ قَالَ: هَذَا عيسَى. ثُمَّ مَرَرْتُ بإِبْرَاهيمَ، فَقَالَ: مَرْحَبًا بالنَّبىِّ الصَّالح وَالابْنِ الصَّالح. قُلْتُ: مَنْ هَذَا؟ قَالَ هَذَا إِبْرَاهيمُ ﷺ. قَالَ: وَ كَانَ ابْنَ عَبَّاسٍ وَأَبَا حَبَّةَ الأَنْصَارِىَّ ﷺ يَقُولاَن: قَالَ النَّبىُّ ﷺ: «ثُمَّ عُرجَ بى حَتَّى ظَهَرْتُ لمُسْتَوًى أَسْمَعُ فيه صَريفَ الأَقْلاَم». قَالَ أَنَسُ بْنُ مَالك: قَالَ النَّبىُّ ﷺ: «فَفَرَضَ اللَّهُ عَلَى أُمَّتى خَمْسينَ صَلاَةً، فَرَجَعْتُ بذَلكَ حَتَّى مَرَرْتُ عَلَى مُوسَى، فَقَالَ: مَا فَرَضَ اللَّهُ لَكَ عَلَى أُمَّتكَ؟ قُلْتُ: فَرَضَ خَمْسينَ صَلاَةً. قَالَ: فَارْجعْ إِلَى رَبِّكَ، فَإِنَّ أُمَّتَكَ لاَ تُطيقُ ذَلكَ. فَرَاجَعْتُ فَوَضَعَ شَطْرَهَا، فَرَجَعْتُ إِلَى مُوسَى قُلْتُ: وَضَعَ شَطْرَهَا، فَقَالَ: رَاجعْ رَبَّكَ، فَإِنَّ أُمَّتَكَ لاَ تُطيقُ، فَرَاجَعْتُ فَوَضَعَ شَطْرَهَا، فَرَجَعْتُ إِلَيْه، فَقَالَ: ارْجعْ إِلَى رَبِّكَ، فَإِنَّ أُمَّتَكَ لاَ تُطيقُ ذَلكَ، فَرَاجَعْتُهُ، فَقَالَ: هىَ خَمْسٌ وَهىَ خَمْسُونَ، لاَ يُبَدَّلُ الْقَوْلُ لَدَىَّ. فَرَجَعْتُ إِلَى مُوسَى فَقَالَ: رَاجعْ رَبَّكَ. فَقُلْتُ: اسْتَحْيَيْتُ منْ رَبِّى، ثُمَّ انْطَلَقَ بى حَتَّى انْتَهَى بى إِلَى سدْرَة الْمُنْتَهَى، وَغَشيَهَا أَلْوَانٌ لاَ أَدْرى مَا هىَ، ثُمَّ أُدْخلْتُ الْجَنَّةَ، فَإِذَا فيهَا حَبَايلُ اللُّؤْلُؤ، وَإِذَا تُرَابُهَا الْمسْكُ». [رواه البخاري: ٣٤٩]

**228.** Ənəs ibn Malik ﷺ Əbu Zərdən ﷺ belə rəvayət etmişdir ki, Peyğəmbər ﷺ demişdir: "Mən Məkkədə ikən evimin damı aralandı və Cəbrail (yanıma) endi.

[1] Burada gecə səfəri deyildikdə, Peyğəmbərin ﷺ Məkkədən Qüdsə getməsi, sonra oradan Allahın hüzuruna qalxması nəzərdə tutulur. Bu hadisə "əl-İsra" surəsinin 1-ci ayəsində və "ən-Nəcm" surəsinin 12-17-ci ayələrində öz əksini tapmışdır.

Köksümü yardıqdan sonra onun içini Zəm-zəm suyu ilə yudu. Sonra içi hikmət və imanla dolu olan qızıl ləyən gətirib içindəkiləri köksümə boşaltdı və onu bağladı. Sonra əlimdən tutub məni yerə ən yaxın olan göyə qaldırdı. Mən yaxın göyə gəlib çatdıqda Cəbrail səmanın gözətçisinə: "Aç"– dedi. (Gözətçi): "Kimdir?"– deyə soruşdu. O: "Cəbraildir!"– dedi. (Gözətçi): "Yanında kimsə varmı?"– deyə soruşdu. Cəbrail: "Muhəmməd ﷺ yanımdadır!"– dedi. (Gözətçi) soruşdu: "Ona (gəlsin deyə) xəbər göndərildimi?" Cəbrail: "Bəli!"– dedi. (Göy qapıları) açıldıqda biz yaxın göyün üstünə qalxdıq və orada oturmuş bir adam gördük ki, onun sağ və sol tərəfində (insanlardan ibarət) toplumlar var idi. Bu adam sağa baxanda gülür, sola baxanda isə ağlayırdı. O, (məni görüb) dedi: "Əməlisaleh peyğəmbər və əməlisaleh oğul xoş gəlibdir!" Mən Cəbraildən: "Bu kimdir?"– deyə soruşdum. Dedi: "Bu Adəmdir, onun sağında və solunda olan toplumlar isə zürriyyətinin ruhlarıdır. Sağında duranlar Cənnət əhli, solunda duranlar isə Cəhənnəm əhlidir. (Buna görə də) sağına baxanda gülür, soluna baxanda ağlayır." Sonra Cəbrail mənimlə ikinci göyə qalxdı və onun gözətçisinə: "Aç"– dedi. Bu gözətçi də ona əvvəlki gözətçinin dediyini deyəndən sonra (qapını) açdı.

Ənəs ؓ demişdir: "Əbu Zərr Peyğəmbərin ﷺ göylərdə Adəmi, İdrisi, Musanı, İsanı və İbrahimi – onların hamısına Allahın salavatı olsun – gördüyünü söyləsə də, onların məqamları barədə dəqiq bir söz demədi. Yalnız Adəmi aşağı göydə, İbrahimi də altıncı göydə gördüyünü söylədi.

Ənəs ؓ demişdir: "Cəbrail Peyğəmbərlə ﷺ birlikdə İdrisin yanına gəldikdə (İdris): "Əməlisaleh peyğəmbər və əməlisaleh qardaş xoş gəlibdir!"– dedi."

(Peyğəmbər ﷺ demişdir:) "Mən: "Bu kimdir?"– deyə soruşdum. Cəbrail: "İdrisdir"– dedi. Sonra mən Musanın yanına gəldim. (Musa): "Əməlisaleh peyğəmbər və əməlisaleh qardaş xoş gəlibdir!"– dedi. Mən: "Bu kimdir?"– deyə soruşdum. Cəbrail: "Musadır"– dedi. Sonra mən İsanın yanına gəldim. (İsa): "Əməlisaleh qardaş və əməlisaleh peyğəmbər xoş gəlibdir!"– dedi. Mən: "Bu kimdir?"– deyə soruşdum. Cəbrail: "İsadır"– dedi. Sonra mən İbrahimin yanına gəldim. İbrahim: "Əməlisaleh peyğəmbər və əməlisaleh övlad xoş gəlibdir!"– dedi. Mən: "Bu kimdir?"– deyə soruşdum. Cəbrail: "İbrahim səllallahu əleyhi və səlləmdir"– dedi."

(İbn Şihab[1] ؒ) İbn Abbasdan رضي الله عنهما və Əbu Həbbə əl-Ənsaridən ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sonra (Cəbrail) mənimlə elə bir yüksəkliyə qalxdı ki, mən qələmlərin xışıltısını[2] eşitdim."

Ənəs ibn Malik ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah mənim ümmətimə əlli *vaxt* namaz qılmağı vacib buyurdu. Mən geri qayıdarkən Musanın yanına gəlib çatdıqda, o: "Allah sənin ümmətinə nəyi əmr etdi?"– deyə soruşdu. Dedim: "Əlli *vaxt* namaz qılmağı vacib buyurdu." Musa dedi: "Rəbbinin yanına qayıt (və Ondan bu hökmü yüngülləşdirməyi xahiş et). Çünki sənin ümmətin bunun öhdəsindən gələ bilməyəcək." Mən yenidən (Ona) müraciət etdim və O (bu) sayı bir qədər azaltdı. Sonra Musanın yanına qayıdıb: "O, (bu) sayı bir qədər azaltdı"– dedim. Musa dedi: "Yenə Rəbbinə müraciət et. Çünki sənin ümmətin bunun öhdəsindən gələ bilməyəcək." Mən yenidən

[1] İbn Şihab ؒ bu hədisi rəvayət edənlərdən biridir.
[2] Burada xışıltı deyildikdə Allahın buyruqlarını yazan mələklərin qələmlərinin xışıltısı qəsd edilir.

(Ona) müraciət etdim və O, (bu) sayı bir qədər də azaltdı. Sonra Musanın yanına qayıtdım. O dedi: “Yenə Rəbbinə müraciət et. Çünki sənin ümmətin bunun öhdəsindən gələ bilməyəcək.” Mən yenidən (Allaha) müraciət etdim, O isə: “Onlar (sayca) beşdir, (savab baxımından isə) əllidir, çühki Mənim sözüm dəyişməzdir”– deyə buyurdu və mən Musanın yanına qayıtdım. O: “Yenə Rəbbinə müraciət et!”– dedi. Lakin mən: “Rəbbimdən utanıram”– dedim. Sonra (Cəbrail) məni son həddəki Sidr ağacının yanına apardı. Onun rəngləri vəsfəgəlməzdir. Sonra məni Cənnətə daxil etdilər. Orada mən incilər düzülmüş boyunbağılar, habelə (Cənnət) torpağının müşk olduğunu gördüm.” (əl-Buxari, 349)

٢٢٩ – عَنْ عَائِشَةَ أُمِّ الْمُؤْمِنِينَ رضي الله عنها قَالَتْ: «فَرَضَ اللَّهُ الصَّلاَةَ حِينَ فَرَضَهَا رَكْعَتَيْنِ رَكْعَتَيْنِ فِى الْحَضَرِ وَالسَّفَرِ، فَأُقِرَّتْ صَلاَةُ السَّفَرِ، وَزِيدَ فِى صَلاَةِ الْحَضَرِ». [رواه البخاري: ٣٥٠]

**229.** Aişə رضي الله عنها rəvayət edir ki, Allah səfərdə və evdə qılınan namazları iki rükət-iki rükət qılmağı əmr etmişdi, sonralar isə səfərdə qılınan namazlar olduğu kimi qaldı, daimi yaşayış yerində qılınan namazlara isə (bir və ya iki rükət) artırıldı.” (əl-Buxari, 350)

## 2-ci fəsil. Paltarda namaz qılmağın vacib olması

## ٢– باب: وُجُوبُ الصَّلاَةِ فِى الثِّيَابِ

٢٣٠ – عَنْ عُمَرَ بْنِ أَبِى سَلَمَةَ رضي الله عنه، أَنَّ النَّبِىَّ ﷺ صَلَّى فِى ثَوْبٍ وَاحِدٍ قَدْ خَالَفَ بَيْنَ طَرَفَيْهِ. [رواه البخاري: ٣٥٤]

**230.** Ömər ibn Əbu Sələmə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ bir paltarda namaz qılar və onun ətəklərini bir-birinin üstünə aşıraraq çiyinlərini örtərdi. (əl-Buxari, 354)

## 3-cü fəsil. Tək bir örtüyə bürünüb namaz qılmaq

## ٣– باب: الصَّلاَةُ فِى الثَّوْبِ الْوَاحِدِ مُلْتَحِفًا بِهِ

٢٣١ – عَنْ أُمِّ هَانِئٍ بِنْتِ أَبِى طَالِبٍ رضي الله عنها قَالَتْ: ذَهَبْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ عَامَ الْفَتْحِ، فَوَجَدْتُهُ يَغْتَسِلُ، وَفَاطِمَةُ ابْنَتُهُ
٢٣٢ – تَسْتُرُهُ قَالَتْ: فَسَلَّمْتُ عَلَيْهِ فَقَالَ: «مَنْ هَذِهِ؟». فَقُلْتُ: أَنَا أُمُّ هَانِئٍ بِنْتُ أَبِى طَالِبٍ. فَقَالَ: «مَرْحَبًا بِأُمِّ هَانِئٍ». فَلَمَّا فَرَغَ مِنْ غُسْلِهِ، قَامَ فَصَلَّى ثَمَانِىَ رَكَعَاتٍ، مُلْتَحِفًا فِى ثَوْبٍ وَاحِدٍ، فَلَمَّا انْصَرَفَ قُلْتُ: يَا رَسُولَ اللَّهِ، زَعَمَ ابْنُ أُمِّى أَنَّهُ قَاتِلٌ رَجُلاً قَدْ أَجَرْتُهُ فُلاَنَ بْنَ هُبَيْرَةَ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «قَدْ أَجَرْنَا مَنْ أَجَرْتِ يَا أُمَّ هَانِئٍ». قَالَتْ: أُمُّ هَانِئٍ وَذَاكَ ضُحًى. [رواه البخاري: ٣٥٧]

**231.** Ummu Hani bint Əbu Talib رضي الله عنها rəvayət edir ki, Məkkənin fəthi ilində mən
**232.** Peyğəmbərin ﷺ yanına getdim və onun qüsl etdiyini, Fatimənin رضي الله عنها də (ona) pərdə tutduğunu gördüm. Mən Peyğəmbərə ﷺ salam verdim. O: “Bu (qadın) kimdir?”– deyə soruşdu. “Mənəm, Əbu Talibin qızı Ummu Hani”– deyə cavab verdim. Peyğəmbər ﷺ: “Xoş gəlibsən, Ummu Hani!”– dedi və qüsl edib qurtardıqdan sonra tək bir örtüyə bürünüb səkkiz rükət namaz qıldı. Namazını qılıb

qurtardıqdan sonra mən dedim: "Ya Rəsulallah! Qardaşım[1] himayəmə götürdüyüm Hubeyranın oğlu filankəsi öldürəcəyini söyləyir." Peyğəmbər ﷺ dedi: "Sənin himayəyə götürdüyün kimsəni biz də himayəmiz altına götürürük, ey Ummu Hani!"

Ummu Hani ﵂ dedi: "O vaxt səhər açılmışdı (Duha namazının vaxtı idi)." (əl-Buxari, 357)

٢٣٣ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁، أَنَّ سَائِلاً سَأَلَ رَسُولَ اللَّهِ ﷺ عَنِ الصَّلاَةِ فِى ثَوْبٍ وَاحِدٍ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَوَلِكُلِّكُمْ ثَوْبَانِ». [رواه البخاري: ٣٥٨]

**233.** Əbu Hureyra ﵁ rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ tək bir libasda namaz qılmaq barədə soruşdu. Peyğəmbər ﷺ dedi: "Məgər sizin hər birinizin iki libası var?!" (əl-Buxari, 358)

## 4-cü fəsil. Tək bir paltarda namaz qılındığı zaman (namaz qılan) adam onun ətəklərini çiyninə atmalıdır

## ٤– باب: إِذَا صَلَّى فِى الثَّوْبِ الْوَاحِدِ فَلْيَجْعَلْ عَلَى عَاتِقَيْهِ

٢٣٤ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «لاَ يُصَلِّى أَحَدُكُمْ فِى الثَّوْبِ الْوَاحِدِ، لَيْسَ عَلَى عَاتِقَيْهِ شَىْءٌ». [رواه البخاري: ٣٥٩]

**234.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən heç biriniz bir paltarda çiyinləri açıq namaz qılmasın." (əl-Buxari, 359)

٢٣٥ – عَنْهُ ﵁ قَالَ: أَشْهَدُ أَنِّى سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «مَنْ صَلَّى فِى ثَوْبٍ وَاحِدٍ، فَلْيُخَالِفْ بَيْنَ طَرَفَيْهِ». [رواه البخاري: ٣٦٠]

**235.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdiyimə şahidlik edirəm: "Qoy bir paltarda namaz qılan kəs onun ətəklərini bir-birinin üstünə ataraq çiyinlərini örtsün." (əl-Buxari, 360)

## 5-ci fəsil. Paltar çox dar olduqda (nə etməli)

## ٥– باب: إِذَا كَانَ الثَّوْبُ ضَيِّقًا

٢٣٦ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵁ قَالَ: خَرَجْتُ مَعَ النَّبِىِّ ﷺ فِى بَعْضِ أَسْفَارِهِ، فَجِئْتُ لَيْلَةً لِبَعْضِ أَمْرِى، فَوَجَدْتُهُ يُصَلِّى، وَعَلَىَّ ثَوْبٌ وَاحِدٌ، فَاشْتَمَلْتُ بِهِ وَصَلَّيْتُ إِلَى جَانِبِهِ، فَلَمَّا انْصَرَفَ قَالَ: «مَا السُّرَى يَا جَابِرُ؟» فَأَخْبَرْتُهُ بِحَاجَتِى، فَلَمَّا فَرَغْتُ قَالَ: «مَا هَذَا الاشْتِمَالُ الَّذِى رَأَيْتُ؟» قُلْتُ: كَانَ ثَوْبٌ، قَالَ: «فَإِنْ كَانَ وَاسِعًا فَالْتَحِفْ بِهِ، وَإِنْ كَانَ ضَيِّقًا فَاتَّزِرْ بِهِ». [رواه البخاري: ٣٦١]

[1] Burada Ummu Hani ﵂ doğma qardaşı Əli ibn Əbu Talibi ﵁ nəzərdə tutur.

**236.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbərlə ﷺ birlikdə səfərdə olduğumuz zaman öz işimə görə gecə onun yanına gəldim və onun namaz qıldığını gördüm. Əynimdə bir paltar var idi. Mən paltara bürünüb onun yanında namaz qıldım. (Namazı) bitirdikdən sonra: "Gecə vaxtı səni bura gətirən nədir, ey Cabir?"– deyə soruşdu. Mən gəlişimin məqsədini ona bildirdim. (Sözümü) bitirdikdən sonra: "Bəs bu gördüyüm bürünməyin[1] nə idi?"– deyə soruşdu. Mən: "Bu paltar (çox dardır)"– dedim. Onda Peyğəmbər ﷺ buyurdu: "Paltarın geniş olarsa, ona bürün (çiyinlərini də ört), çox dar olarsa, onu belinə bağla (göbəkdən dizə qədər bədəninə dola)." (əl-Buxari, 361)

**٢٣٧** – عَنْ سَهْلٍ ﷺ قَالَ: كَانَ رِجَالٌ يُصَلُّونَ مَعَ النَّبِيِّ ﷺ عَاقِدِي أُزْرِهِمْ عَلَى أَعْنَاقِهِمْ، كَهَيْئَةِ الصِّبْيَانِ، وَقَالَ لِلنِّسَاءِ: «لاَ تَرْفَعْنَ رُءُوسَكُنَّ حَتَّى يَسْتَوِيَ الرِّجَالُ جُلُوسًا». [رواه البخاري: ٣٦٢]

**237.** Səhl ﷺ rəvayət edir ki, bəzi əshabələr fitələrinin ətəklərini oğlan uşaqlarının etdiyi kimi boyunlarına bağlayıb Peyğəmbərlə ﷺ birlikdə namaz qılardılar. (Buna görə də) Peyğəmbər ﷺ (camaat namazına gələn qadınlara) deyərdi: "Kişilər qalxıb oturanadək siz başınızı (səcdədən) qaldırmayın" (əl-Buxari, 362)

## 6-cı fəsil. Şamda istehsal olunmuş cübbədə namaz qılmaq

## ٦– باب: الصَّلاَةُ فِي الْجُبَّةِ الشَّامِيَّةِ

**٢٣٨** – عَنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ﷺ قَالَ: كُنْتُ مَعَ النَّبِيِّ ﷺ فِي سَفَرٍ، فَقَالَ: «يَا مُغِيرَةُ، خُذِ الإِدَاوَةَ». فَأَخَذْتُهَا، فَانْطَلَقَ رَسُولُ اللَّهِ ﷺ حَتَّى تَوَارَى عَنِّي فَقَضَى حَاجَتَهُ، وَعَلَيْهِ جُبَّةٌ شَأْمِيَّةٌ، فَذَهَبَ لِيُخْرِجَ يَدَهُ مِنْ كُمِّهَا فَضَاقَتْ، فَأَخْرَجَ يَدَهُ مِنْ أَسْفَلِهَا، فَصَبَبْتُ عَلَيْهِ فَتَوَضَّأَ وُضُوءَهُ لِلصَّلاَةِ، وَمَسَحَ عَلَى خُفَّيْهِ، ثُمَّ صَلَّى. [رواه البخاري: ٣٦٣]

**238.** Muğira ibn Şobə ﷺ rəvayət edir ki, (bir dəfə) mən Peyğəmbərlə ﷺ birlikdə səfərdə olarkən o mənə: "Ey Muğira, götür bu qabı"– deyə buyurdu. Mən də onu götürdüm. Peyğəmbər ﷺ gözdən itənədək uzağa gedib təbii ehtiyacını rəf etdi. Onun əynində Şam cübbəsi var idi. O, əlini cübbənin qolundan çıxarmaq istədikdə onun çox dar olduğunu gördü və (buna görə də) əlini cübbənin aşağı tərəfindən çıxartdı. Mən onun əlinə su tökdüm və o, namaz üçün dəstəmaz aldığı qaydada dəstəmaz alıb məstlərinə məsh çəkdi, sonra da namaz qıldı. (əl-Buxari, 363)

## 7-ci fəsil. Namaz əsnasında çılpaq olmağın bəyənilməməsi

## ٧– باب: كَرَاهِيَةُ التَّعَرِّي فِي الصَّلاَةِ

**٢٣٩** – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ يُحَدِّثُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَنْقُلُ مَعَهُمُ الْحِجَارَةَ لِلْكَعْبَةِ وَعَلَيْهِ إِزَارُهُ، فَقَالَ لَهُ الْعَبَّاسُ عَمُّهُ: يَا ابْنَ أَخِي، لَوْ حَلَلْتَ إِزَارَكَ فَجَعَلْتَ عَلَى مَنْكِبَيْكَ دُونَ الْحِجَارَةِ، قَالَ، فَحَلَّهُ فَجَعَلَهُ عَلَى مَنْكِبَيْهِ، فَسَقَطَ مَغْشِيًّا عَلَيْهِ، فَمَا رُئِيَ بَعْدَ ذَلِكَ عُرْيَانًا. [رواه البخاري: ٣٦٤]

---

[1] Peyğəmbərin ﷺ bu sualı verməsi ona görə idi ki, Cabir ﷺ paltarına büründükdə onun ətəklərini çiynine atmışdı və az qala ayıb yerləri açıq qalacaqdı.

**239.** Cabir ibn Abdullah ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ izarını[1] belinə bağlayıb qureyşlilərlə birlikdə Kəbə (evinin yenidən tikilməsi) üçün daş daşıdığı zaman əmisi Abbas ﵁ ona dedi: "Ey qardaşoğlu! Bəlkə izarını açıb çiyninə, (daşıdığın) daşların altına qoyasan."

(Cabir) dedi: "O, izarını açıb çiyninə qoyan kimi özündən getdi və bundan sonra onu bir daha heç kim izarsız görmədi." (əl-Buxari, 364)

## 8-ci fəsil. Bədənin hansı hissələri örtülməlidir

## ٨– باب: مَا يَسْتُرُ مِنَ العَوْرَةِ

٢٤٠ – عَنْ أَبِى سَعِيدِ الْخُدْرِىِّ ﵁ أَنَّهُ قَالَ نَهَى رَسُولُ اللَّهِ ﷺ عَنِ اشْتِمَالِ الصَّمَّاءِ وَأَنْ يَحْتَبِىَ الرَّجُلُ فِى ثَوْبٍ وَاحِدٍ، لَيْسَ عَلَى فَرْجِهِ مِنْهُ شَىْءٌ. [رواه البخاري: ٣٦٧]

**240.** Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ (əshabələrə) paltarlarına tam bürünməyi[2], habelə təkcə bir paltar geymiş kişiyə yerə oturub dizlərini qaldırıb qolları ilə onları qucaqlayaraq ayıb yerlərini açıq qoymağı qadağan etmişdi. (əl-Buxari, 367)

٢٤١ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ قَالَ نَهَى النَّبِىُّ ﷺ عَنْ بَيْعَتَيْنِ عَنِ اللِّمَاسِ وَالنِّبَاذِ، وَأَنْ يَشْتَمِلَ الصَّمَّاءَ، وَأَنْ يَحْتَبِىَ الرَّجُلُ فِى ثَوْبٍ وَاحِدٍ. [رواه البخاري: ٣٦٨]

**241.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ iki cür alış-verişi – əl sürtməklə[3] və bir də atmaqla[4] aparılan alış-verişi, həmçinin paltara tam bürünməyi və bir də təkcə bir paltar geymiş kişiyə yerə oturub dizlərini qaldırıb qolları ilə onları qucaqlamağı qadağan etdi. (əl-Buxari, 368)

٢٤٢ – عَنْهُ ﵁ قَالَ بَعَثَنِى أَبُو بَكْرٍ فِى تِلْكَ الْحَجَّةِ فِى مُؤَذِّنِينَ يَوْمَ النَّحْرِ نُؤَذِّنُ بِمِنًى أَنْ لاَ يَحُجَّ بَعْدَ الْعَامِ مُشْرِكٌ، وَلاَ يَطُوفَ بِالْبَيْتِ عُرْيَانٌ. قَالَ حُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ ثُمَّ أَرْدَفَ رَسُولُ اللَّهِ ﷺ عَلِيًّا، فَأَمَرَهُ أَنْ يُؤَذِّنَ بِبَرَاءَةَ قَالَ أَبُو هُرَيْرَةَ فَأَذَّنَ مَعَنَا عَلِىٌّ فِى أَهْلِ مِنًى يَوْمَ النَّحْرِ لاَ يَحُجُّ بَعْدَ الْعَامِ مُشْرِكٌ، وَلاَ يَطُوفُ بِالْبَيْتِ عُرْيَانٌ. [رواه البخاري: ٣٦٩]

**242.** Əbu Hureyra ﵁ rəvayət edir ki, həcc ziyarəti əsnasında Əbu Bəkr məni müəzzinlərlə birlikdə göndərdi ki, qurban günü Mina vadisinə gedib orada (insanlara) elan edək ki, gələn ildən başlayaraq heç bir müşrik həcc ziyarətinə gəlməyəcək və heç kəs lüt-üryan Kəbəni təvaf etməyəcəkdir."

Humeyd ibn Abdur-Rəhman dedi: "Bunun ardınca Peyğəmbər ﷺ Əli ibn Əbu Talibi ﵁ (Əbu Bəkrin ﵁ yanına) göndərib tapşırdı ki, "Bəraət"[5] surəsinin nazil olduğunu (camaata) elan etsin."

---

[1] İzar – qurşaqdan aşağı bədən əzalarını örtmək üçün belə bağlanılan örtük.

[2] Elə bürünmək ki, paltarın ətəyini qaldırıb onun altından qollarını çıxarmaq mümkün olmasın.

[3] Burada söhbət, mala sadəcə əl vurmaqla (yəni onu lazımınca yoxlamadan) razılaşmaqla aparılan alış-verişdən gedir. Buna ərəbcə "limas" və ya "mülaməsə" deyilir.

[4] Burada atmaq deyildikdə, satıcının malı alıcıya göstərmədən onun üstünə bir şey atıb, sonra da ona bu malı almağa məcbur etməsi qəsd edilir. Buna da ərəbcə "nibaz" yaxud "münabəzə" deyilir.

[5] Yəni "ət-Tovbə" surəsi.

Əbu Hureyra ﷺ demişdir: "Qurban günü Əli ibn Əbu Talib bizimlə birlikdə Minadakılara elan edib gələn ildən heç bir müşrikin həcc ziyarətinə gəlməyəcəyini və heç kəsin lüt-üryan Kəbəni təvaf etməyəcəyini bildirdi." (əl-Buxari, 369)

## 9-cu fəsil. Bud barədə deyilənlər

## ٩– باب: مَا يُذْكَرُ فِى الْفَخِذ

٢٤٣ – عَنْ أَنَسٍ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ غَزَا خَيْبَرَ، فَصَلَّيْنَا عِنْدَهَا صَلاَةَ الْغَدَاةِ بِغَلَسٍ، فَرَكِبَ نَبِىُّ اللَّهِ ﷺ وَرَكِبَ أَبُو طَلْحَةَ، وَأَنَا رَدِيفُ أَبِى طَلْحَةَ، فَأَجْرَى نَبِىُّ اللَّهِ ﷺ فِى زُقَاقِ خَيْبَرَ، وَإِنَّ رُكْبَتِى لَتَمَسُّ فَخِذَ نَبِىِّ اللَّهِ ﷺ، ثُمَّ حَسَرَ الإِزَارَ عَنْ فَخِذِهِ حَتَّى إِنِّى أَنْظُرُ إِلَى بَيَاضِ فَخِذِ نَبِىِّ اللَّهِ ﷺ، فَلَمَّا دَخَلَ الْقَرْيَةَ قَالَ: «اللَّهُ أَكْبَرُ، خَرِبَتْ خَيْبَرُ، إِنَّا إِذَا نَزَلْنَا بِسَاحَةِ قَوْمٍ فَسَاءَ صَبَاحُ الْمُنْذَرِينَ». قَالَهَا ثَلاَثًا، قَالَ: وَخَرَجَ الْقَوْمُ إِلَى أَعْمَالِهِمْ فَقَالُوا مُحَمَّدٌ وَالْخَمِيسُ – يَعْنِى الْجَيْشَ – قَالَ: فَأَصَبْنَاهَا عَنْوَةً، فَجُمِعَ السَّبْىُ، فَجَاءَ دِحْيَةُ فَقَالَ: يَا نَبِىَّ اللَّهِ، أَعْطِنِى جَارِيَةً مِنَ السَّبْىِ، قَالَ: «اذْهَبْ فَخُذْ جَارِيَةً». فَأَخَذَ صَفِيَّةَ بِنْتَ حُيَىٍّ، فَجَاءَ رَجُلٌ إِلَى النَّبِىِّ ﷺ فَقَالَ: يَا نَبِىَّ اللَّهِ، أَعْطَيْتَ دِحْيَةَ صَفِيَّةَ بِنْتَ حُيَىٍّ سَيِّدَةَ قُرَيْظَةَ وَالنَّضِيرِ؟ لاَ تَصْلُحُ إِلاَّ لَكَ. قَالَ: «ادْعُوهُ بِهَا». فَجَاءَ بِهَا، فَلَمَّا نَظَرَ إِلَيْهَا النَّبِىُّ ﷺ قَالَ: «خُذْ جَارِيَةً مِنَ السَّبْىِ غَيْرَهَا». قَالَ: فَأَعْتَقَهَا النَّبِىُّ ﷺ وَتَزَوَّجَهَا. فَقَالَ لَهُ ثَابِتٌ: مَا أَصْدَقَهَا؟ قَالَ: نَفْسَهَا، أَعْتَقَهَا وَتَزَوَّجَهَا، حَتَّى إِذَا كَانَ بِالطَّرِيقِ جَهَّزَتْهَا لَهُ أُمُّ سُلَيْمٍ فَأَهْدَتْهَا لَهُ مِنَ اللَّيْلِ، فَأَصْبَحَ النَّبِىُّ ﷺ عَرُوسًا، فَقَالَ: «مَنْ كَانَ عِنْدَهُ شَىْءٌ فَلْيَجِئْ بِهِ». وَبَسَطَ نِطَعًا، فَجَعَلَ الرَّجُلُ يَجِىءُ بِالتَّمْرِ، وَجَعَلَ الرَّجُلُ يَجِىءُ بِالسَّمْنِ، قَالَ: وَأَحْسِبُهُ قَدْ ذَكَرَ السَّوِيقَ، قَالَ: فَحَاسُوا حَيْسًا، فَكَانَتْ وَلِيمَةَ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٣٧١]

**243.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ qoşun yığıb Xeybərə yollandı. Biz bu (kəndin) yaxınlığında, səhər ala-qaranlıqda sübh namazını qıldıq. (Bundan) sonra Peyğəmbər ﷺ və Əbu Təlhə (öz miniklərinə) mindilər. Mən isə Əbu Təlhənin tərkinə mindim. Peyğəmbər ﷺ (miniyini) Xeybərin dar küçələrindən birinə sürdü və (bu vaxt) mənim dizim Peyğəmbərin ﷺ buduna toxundu, onun izarı[1] (yuxarı qalxdı və) budu açıldı, onda mən Peyğəmbərin ﷺ budunun ağlığını gördüm. Kəndə daxil olduqda o: "Allahu Əkbər! Xeybər dağıldı. Həqiqətən, biz (fasiq) qövmün yurduna daxil olduqda, qorxudulanların sabahı necə də pis olar!"– dedi və (bunu) üç dəfə təkrar etdi."

Ənəs ﷺ dedi: "Xeybərlilər öz işlərindən ötrü (evlərindən) çıxıb: "Muhəmməd öz qoşunuyla (gəldi)!"– dedilər."

Ənəs ﷺ dedi: "Biz Xeybəri zəbt etdik. Əsirlər bir yerə toplanıldıqdan sonra Dihyə gəlib dedi: "Ey Allahın Peyğəmbəri, əsir düşmüş cariyələrdən[2] birini mənə ver." (Peyğəmbər ﷺ): "Get birini götür!"– dedi və o da Səfiyyə bint Hüyeyyi götürdü. Bundan sonra bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ey Allahın Peyğəmbəri, sən Dihyəyə Qureyza və Nədir qəbilələrinin xanımı[3] Səfiyyə bint Hüyeyyi verdin, halbuki o qadın ancaq sənə layiqdir." (Onda Pey-

[1] 239-cu hədisin qeydlərinə bax.

[2] Cariyə - keçmiş zamanlarda cihadda ələ keçirilib azadlıqdan məhrum edilən, pulla alınıb-satıla bilən, hər cəhətdən sahibinin arzularına tabe olan qız və ya qadındır.

[3] Xeybər fəth edilənə qədər Səfiyyə ﷺ Nədir qəbiləsinin başçılarından birinin – Kinanə ibn Əbu Hukeykin həyat yoldaşı olmuşdu.

ğəmbər ﷺ): “Onu qadınla bir yerdə yanıma çağırın!”– deyə buyurdu. Dihyə Səfiyyəni (onun yanına) gətirdi. Peyğəmbər ﷺ qadına baxıb (Dihyəyə) dedi: “Cariyələrdən başqa birisini götür.”

(Ənəs dedi): “Peyğəmbər ﷺ Səfiyyəni azad edib onunla evləndi.”

Sabit[1] (Ənəsdən) soruşdu ki: “Bəs Peyğəmbər ﷺ ona mehr olaraq nə verdi?” (Ənəs)dedi: “Onun özünü, onu azad etdi və onunla evləndi.”

(Ənəs dedi): “Nəhayət, yolda Ummu Suleym Səfiyyəni Peyğəmbər ﷺ üçün hazırladı və gecə onun yanına apardı. Zifaf gecəsinin səhəri Peyğəmbər ﷺ dedi: “Qoy kimdə (yeməyə) bir şey varsa bura gətirsin” və yerə bir dəri sərdi. (Bu vaxt) kimi xurma, kimi də yağ gətirdi.

(Bu hədisi) rəvayət edənlərdən biri dedi: “Güman edirəm ki, Ənəs sıyığı da qeyd etdi.”

Ənəs dedi: “Sonra onlar heys[2] hazırladılar. Allahın Peyğəmbərinin ﷺ toy ziyafəti belə oldu.” (əl-Buxari, 371)

## 10-cu fəsil. Namazda qadın neçə paltar geyməlidir?

## ١٠– باب: فِى كَمْ تُصَلِّى الْمَرْأَةُ فِى الثِّيَابِ

٢٤٤ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: لَقَدْ كَانَ رَسُولُ اللَّهِ ﷺ يُصَلِّى الْفَجْرَ، فَيَشْهَدُ مَعَهُ نِسَاءٌ مِنَ الْمُؤْمِنَاتِ مُتَلَفِّعَاتٍ فِى مُرُوطِهِنَّ ثُمَّ يَرْجِعْنَ إِلَى بُيُوتِهِنَّ مَا يَعْرِفُهُنَّ أَحَدٌ. [رواه البخاري: ٣٧٢]

**244.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ (məsciddə) sübh namazını qılarkən onunla bərabər mömin qadınlar da (ipəkdən və ya yundan olan) örtüklərinə bürünərək namaz qılardılar və evlərinə qayıdanda heç kəs onları tanımazdı. (əl-Buxari, 372)

## 11-ci fəsil. Bəzəkli paltarda namaz qılan haqqında

## ١١– باب: إِذَا صَلَّى فِى ثَوْبٍ لَهُ أَعْلاَمٌ

٢٤٥ – عَنْ عَائِشَةَ رضي الله عنها، أَنَّ النَّبِىَّ ﷺ صَلَّى فِى خَمِيصَةٍ لَهَا أَعْلاَمٌ، فَنَظَرَ إِلَى أَعْلاَمِهَا نَظْرَةً، فَلَمَّا انْصَرَفَ قَالَ: «اذْهَبُوا بِخَمِيصَتِى هَذِهِ إِلَى أَبِى جَهْمٍ وَائْتُونِى بِأَنْبِجَانِيَّةِ أَبِى جَهْمٍ، فَإِنَّهَا أَلْهَتْنِى آنِفًا عَنْ صَلاَتِى». [رواه البخاري: ٣٧٣]

**245.** Aişə رضي الله عنها rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ bəzəkli paltarda namaz qılarkən onun naxışlarına nəzər saldı. Namazı bitirdikdən sonra isə: “Bu bəzəkli paltarımı aparıb Əbu Cəhmə verin, onun ənbicaniyyəsini[3] mənə gətirin, çünki bu (bəzəkli paltar) bir az əvvəl məni namazdan yayındırdı.” (əl-Buxari, 373)

---

[1] Sabit bu hədisi Ənəsdən رضي الله عنه nəql edən ravidir.
[2] Heys – xurma, ərinmiş yağ və undan hazırlanmış yeməkdir.
[3] Ənbicaniyyə – üstündə heç bir naxışı və bəzəyi olmayan qalın yun əbadır.

## 12-ci fəsil. Üstündə xaç şəkli, yaxud digər rəsmlər olan paltarla qılınan namaz batil olurmu?

## ١٢– باب: إِنْ صَلَّى فِي ثَوْبٍ مُصَلَّبٍ أَوْ تَصَاوِيرَ هَلْ تَفْسُدُ صَلاَتُه

٢٤٦ – عَنْ أَنَسٍ ﷺ: كَانَ قِرَامٌ لِعَائِشَةَ سَتَرَتْ بِهِ جَانِبَ بَيْتِهَا، فَقَالَ النَّبِيُّ ﷺ: «أَمِيطِي عَنَّا قِرَامَكِ هَذَا، فَإِنَّهُ لاَ تَزَالُ تَصَاوِيرُهُ تَعْرِضُ فِي صَلاَتِي». [رواه البخاري: ٣٧٤]

**246.** Ənəs ﷺ rəvayət edir ki, Aişənin bəzəkli nazik yun bir pərdəsi var idi ki, onunla otağının bir hissəsini ayırmışdı. (Bir dəfə) Peyğəmbər ﷺ dedi: “Bu pərdəni götür burdan, çünki onun naxışları həmişə namaz qılarkən gözlərimin önündə durur (və məni namazdan yayındırır).” (əl-Buxari, 374)

## 13-cü fəsil. İpək fərrucda[1] namaz qılıb, sonra onu soyunan adam haqqında

## ١٣– باب: مَنْ صَلَّى فِي فَرُّوجِ حَرِيرٍ ثُمَّ نَزَعَهُ

٢٤٧ – عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ قَالَ: أُهْدِىَ إِلَى النَّبِيِّ ﷺ فَرُّوجُ حَرِيرٍ، فَلَبِسَهُ فَصَلَّى فِيهِ، ثُمَّ انْصَرَفَ فَنَزَعَهُ نَزْعًا شَدِيدًا كَالْكَارِهِ لَهُ وَقَالَ: «لاَ يَنْبَغِي هَذَا لِلْمُتَّقِينَ». [رواه البخاري: ٣٧٥]

**247.** Üqbə ibn Amir ﷺ rəvayət edir ki, Peyğəmbərə ﷺ arxasında kəsik olan ipək paltar hədiyyə etmişdilər. O, bu paltarı geyib onda namaz qıldı və (namazı) bitirdikdən sonra nifrət etdiyi bir şey kimi onu tez əynindən çıxarıb dedi: “Allahdan qorxanlara bunu (geymək) yaraşmaz.” (əl-Buxari, 374)

## 14-cü fəsil. Qırmızı rəngli paltarda namaz qılmaq

## ١٤– باب: الصَّلاَةُ فِي الثَّوْبِ الأَحْمَرِ

٢٤٨ – عَنْ أَبِي جُحَيْفَةَ ﷺ، قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ فِي قُبَّةٍ حَمْرَاءَ مِنْ أَدَمٍ، وَرَأَيْتُ بِلاَلاً أَخَذَ وَضُوءَ رَسُولِ اللَّهِ ﷺ وَرَأَيْتُ النَّاسَ يَبْتَدِرُونَ ذَاكَ الْوَضُوءَ، فَمَنْ أَصَابَ مِنْهُ شَيْئًا تَمَسَّحَ بِهِ، وَمَنْ لَمْ يُصِبْ مِنْهُ شَيْئًا أَخَذَ مِنْ بَلَلِ يَدِ صَاحِبِهِ، ثُمَّ رَأَيْتُ بِلاَلاً أَخَذَ عَنَزَةً فَرَكَزَهَا، وَخَرَجَ النَّبِيُّ ﷺ فِي حُلَّةٍ حَمْرَاءَ مُشَمِّرًا، صَلَّى إِلَى الْعَنَزَةِ بِالنَّاسِ رَكْعَتَيْنِ، وَرَأَيْتُ النَّاسَ وَالدَّوَابَّ يَمُرُّونَ مِنْ بَيْنِ يَدَىِ الْعَنَزَةِ. [رواه البخاري: ٣٧٦]

**248.** Əbu Cuheyfə rəvayət edir ki, mən Peyğəmbəri ﷺ qırmızı dəri çadırda olarkən gördüm. Habelə, Bilalın Peyğəmbərin ﷺ (dəstəmaz aldıqdan sonra qalmış) suyunu götürdüyünü və insanların bir-birini ötməyə çalışaraq bu suya doğru necə qaçdıqlarını da gördüm. Kimlərə bu sudan çatdısa, onu (bədəninə) sürtdü, su əldə edə bilməyənlər isə əllərini yoldaşlarının yaş əllərinə vurdular. Sonra gördüm ki, Bilal ucu iti bir paya götürüb yerə batırdı. (Bundan sonra) Peyğəmbər ﷺ qırmızı paltarda, (ətəyi baldırının yarısına qədər) qaldırılmış

[1] Fərruc – arxasında kəsiyi olan üst paltardır.

halda (çadırdan) çıxdı və bu payaya tərəf üz tutub camaata iki rükət namaz qıldırdı. Mən gördüm ki, insanlar və heyvanlar o payanın qabağından keçib gedirlər. (əl-Buxari, 376)

## 15-ci fəsil. Damda, minbərdə və ağacdan (düzəldilmiş əşyaların) üzərində namaz qılmaq

## ١٥– باب: الصَّلاَةُ فِى السُّطُوحِ وَالْمِنبَرِ وَالْخَشَبِ

٢٤٩ – عَنْ سَهْلِ بْنَ سَعْد ﷺ، وَ قَدْ سُئِلَ: مِنْ أَىِّ شَىْءِ الْمِنْبَرُ؟ فَقَالَ: مَا بَقِىَ بِالنَّاسِ أَعْلَمُ مِنِّى، هُوَ مِنْ أَثْلِ الْغَابَة، عَمِلَهُ فُلاَنٌ مَوْلَى فُلاَنَةَ لِرَسُولِ اللَّه ﷺ، وَقَامَ عَلَيْهِ رَسُولُ اللَّه ﷺ حِينَ عُمِلَ وَوُضِعَ، فَاسْتَقْبَلَ الْقِبْلَةَ كَبَّرَ وَقَامَ النَّاسُ خَلْفَهُ، فَقَرَأَ وَرَكَعَ وَرَكَعَ النَّاسُ خَلْفَهُ، ثُمَّ رَفَعَ رَأْسَهُ، ثُمَّ رَجَعَ الْقَهْقَرَى، فَسَجَدَ عَلَى الأَرْضِ، ثُمَّ عَادَ إِلَى الْمِنْبَرِ، ثُمَّ قَرَأَ ثُمَّ رَكَعَ، ثُمَّ رَفَعَ رَأْسَهُ، ثُمَّ رَجَعَ الْقَهْقَرَى حَتَّى سَجَدَ بِالأَرْضِ، فَهَذَا شَأْنُهُ. [رواه البخاري: ٣٧٧]

**249.** Səhl ibn Səddən ﷺ soruşdular: "(Peyğəmbərin ﷺ) minbəri nədən (düzəldilmişdi)?" (Səhl) dedi: "İnsanlar arasında bunu məndən yaxşı bilən bir kimsə qalmamışdır. O, meşə yulğunundan[1] düzəldilmişdi. Onu Peyğəmbər ﷺ üçün filankəs – filan qadının azad etdiyi köləsi düzəltmişdi. (Minbər) hazırlanıb (məscidə) qoyulduqdan sonra Peyğəmbər ﷺ onun üstünə çıxdı və üzünü qibləyə tutub: "Allahu Əkbər"– dedi, camaat isə onun arxasında durdu. O, (Quran) oxuyub rükuya getdi, camaat da onun arxasında rüku etdi. Sonra o, başını qaldırıb (minbərdən aşağı endi) və dal-dalı gedib yerə səcdə etdi. Bundan sonra o, yenə minbərə qalxdı və (Quran) oxuyub rükuya getdi. Sonra da başını qaldırıb (minbərdən aşağı endi) və dal-dalı gedib yerə səcdə etdi. Minbər haqqında (mənə məlum olan) budur. (əl-Buxari, 377)

## 16-cı fəsil. Həsir üzərində namaz qılmaq

## ١٦– باب: الصَّلاَةُ عَلَى الْحَصِيرِ

٢٥٠ – عَنْ أَنَسِ بْنِ مَالِك ﷺ، أَنَّ جَدَّتَهُ مُلَيْكَةَ دَعَتْ رَسُولَ اللَّه ﷺ لِطَعَامٍ صَنَعَتْهُ لَهُ، فَأَكَلَ مِنْهُ ثُمَّ قَالَ: «قُومُوا فَلأُصَلِّ لَكُمْ». قَالَ أَنَسٌ: فَقُمْتُ إِلَى حَصِيرٍ لَنَا قَد اسْوَدَّ مِنْ طُولِ مَا لُبِسَ، فَنَضَحْتُهُ بِمَاءٍ، فَقَامَ رَسُولُ اللَّه ﷺ وَصَفَفْتُ وَالْيَتِيمَ وَرَاءَهُ، وَالْعَجُوزُ مِنْ وَرَائِنَا، فَصَلَّى لَنَا رَسُولُ اللَّه ﷺ رَكْعَتَيْنِ ثُمَّ انْصَرَفَ. [رواه البخاري: ٣٨٠]

**250.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, nənəsi Muleykə Peyğəmbəri ﷺ onun üçün hazırladığı yeməyə dəvət etmişdi. Peyğəmbər ﷺ yeməyi yedikdən sonra dedi: "Durun, sizə namaz qıldırım."

Ənəs demişdir: "Mən, çox istifadə olunduğundan qaralmış həsirimizə yaxınlaşıb üstünə bir az su səpdim. Sonra Peyğəmbər ﷺ onun üstündə (namaza) durdu. Mən yetim (Dumeyra) ilə birgə onun arxasında durdum, nənəm də bizim arxamızda durdu. Peyğəmbər ﷺ bizə iki rükət namaz qıldırdıqdan sonra çıxıb getdi." (əl-Buxari, 380)

[1] Meşə yulğunu – quraqlığa və şoranlığa davamlı, xırda salxım çiçəkli kol bitkisi.

## 17-ci fəsil. Döşək üzərində namaz qılmaq

## ١٧– باب: الصَّلاَةُ عَلَى الْفِرَاشِ

٢٥١ – عَنْ عَائِشَةَ رضي الله عنها زَوْجِ النَّبِيِّ ﷺ أَنَّهَا قَالَتْ: كُنْتُ أَنَامُ بَيْنَ يَدَىْ رَسُولِ اللَّهِ ﷺ وَرِجْلاَىَ فِى قِبْلَتِهِ، فَإِذَا سَجَدَ غَمَزَنِى، فَقَبَضْتُ رِجْلَىَّ، فَإِذَا قَامَ بَسَطْتُهُمَا. قَالَتْ: وَالْبُيُوتُ يَوْمَئِذٍ لَيْسَ فِيهَا مَصَابِيحُ. [رواه البخاري: ٣٨٢]

**251.** Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها demişdir: "Mən Peyğəmbərin ﷺ qarşısında ayaqlarımı onun qibləsinə tərəf (uzadıb) yatardım. O, səcdəyə getdikdə (əlini) mənə toxundurar və mən ayaqlarımı yığardım, (səcdədən) qalxdıqda isə onları uzadardım."

Aişə dedi: "O vaxtlar evlərdə lampa yox idi." (əl-Buxari, 382)

٢٥٢ – عَنْ عَائِشَةَ رضي الله عنها، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يُصَلِّى وَهِىَ بَيْنَهُ وَبَيْنَ الْقِبْلَةِ عَلَى فِرَاشِ أَهْلِهِ، اعْتِرَاضَ الْجَنَازَةِ. [رواه البخاري: ٣٨٣]

**252.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ namaz qılarkən o, yatağında onunla qiblə arasında ölü kimi uzanardı. (əl-Buxari, 383)

## 18-ci fəsil. Bərk istilər olduqda paltara səcdə etmək

## ١٨– باب: السُّجُودُ عَلَى الثَّوْبِ فِى شِدَّةِ الْحَرِّ

٢٥٣ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: كُنَّا نُصَلِّى مَعَ النَّبِيِّ ﷺ فَيَضَعُ أَحَدُنَا طَرَفَ الثَّوْبِ مِنْ شِدَّةِ الْحَرِّ فِى مَكَانِ السُّجُودِ. [رواه البخاري: ٣٨٥]

**253.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, bəzən biz Peyğəmbərlə ﷺ birlikdə namaz qılarkən bizlərdən bəzisi bərk isti olduğundan paltarının ətəyini səcdə etdiyi yerə sərərdi." (əl-Buxari, 385)

## 19-cu fəsil. Səndəllə namaz qılmaq

## ١٩– باب: الصَّلاَةُ فِى النِّعَالِ

٢٥٤ – عَنْهُ رضي الله عنه، أَنَّهُ سُئِلَ: أَكَانَ النَّبِيُّ ﷺ يُصَلِّى فِى نَعْلَيْهِ؟ قَالَ: نَعَمْ. [رواه البخاري: ٣٨٦]

**254.** Ənəsdən رضي الله عنه soruşdular: "Peyğəmbər ﷺ səndəllə namaz qılıbmı?" O: "Bəli"– deyə cavab verdi. (əl-Buxari, 386)

## 20-ci fəsil. Məstlərlə[1] namaz qılmaq

## ٢٠– باب: الصَّلاَةُ فِى الْخِفَافِ

٢٥٥ – عَنْ جَرِيرَ بْنَ عَبْدِ اللَّهِ رضي الله عنه، أَنَّهُ بَالَ ثُمَّ تَوَضَّأَ، وَمَسَحَ عَلَى خُفَّيْهِ، ثُمَّ قَامَ فَصَلَّى، فَسُئِلَ فَقَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ صَنَعَ مِثْلَ هَذَا.

---

[1] Məst – dəridən və ya başqa yumşaq materialdan tikilən yüngül ayaqqabıdır.

قَالَ إِبْرَاهِيمُ فَكَانَ يُعْجِبُهُمْ، لأَنَّ جَرِيرًا كَانَ مِنْ آخرِ مَنْ أَسْلَمَ. [رواه البخاري: ٣٨٧]

**255.** Cərir ibn Abdullahdan ﷺ rəvayət edilir ki, (bir dəfə) o təbii ehtiyacını rəf etdikdən sonra dəstəmaz aldı və məstlərinə məsh çəkdi. Sonra da qalxıb namaz qıldı. (Bu haqda) ondan soruşduqda: "Mən Peyğəmbərin ﷺ bu cür etdiyini görmüşəm"– dedi.

İbrahim demişdir: "Bu (hədis əshabələrin) xoşuna gəlirdi. Çünki Cərir İslamı gec[1] qəbul edənlərdən idi." (əl-Buxari, 387)

## 21-ci fəsil. (Namaz qılan adam) **səcdədə əllərini aralı qoymalı və böyründən kənara çəkməlidir**

## ٢١– باب: يُبْدِى ضَبْعَيْهِ وَيُجَافِى فِى السُّجُودِ

٢٥٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَالِكٍ ابْنِ بُحَيْنَةَ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا صَلَّى فَرَّجَ بَيْنَ يَدَيْهِ حَتَّى يَبْدُوَ بَيَاضُ إِبْطَيْهِ. [رواه البخاري: ٣٩٠]

**256.** Abdullah ibn Malik ibn Buheynə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ namaz qıldığı zaman əllərini o qədər bir-birindən aralı qoyardı ki, qoltuğunun ağlığı görünərdi. (əl-Buxari, 390)

## 22-ci fəsil. Qibləyə üz tutmağın fəziləti

## ٢٢– باب: فَضْلُ اسْتِقْبَالِ الْقِبْلَةِ

٢٥٧ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ صَلَّى صَلاَتَنَا، وَاسْتَقْبَلَ قِبْلَتَنَا، وَأَكَلَ ذَبِيحَتَنَا، فَذَلِكَ الْمُسْلِمُ الَّذِى لَهُ ذِمَّةُ اللَّهِ وَذِمَّةُ رَسُولِهِ، فَلاَ تُخْفِرُوا اللَّهَ فِى ذِمَّتِهِ». [رواه البخاري: ٣٩١]

**257.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bizim qıldığımız namazı qılır, üzünü qibləmizə çevirir və kəsdiyimiz qurbandan yeyirsə, o, Allahın və Onun elçisinin ﷺ mühafizəsi altında olan müsəlmandır. Belə kimsələrin haqqına girməklə Allaha (və Onun elçisinə ﷺ) xəyanət etməyin." (əl-Buxari, 391)

## 23-cü fəsil. Uca Allahın: «İbrahimin dayandığı yeri namazgah edin!»[2]– sözü

## ٢٣– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَاتَّخِذُوا مِن مَّقَامِ إِبْرَاهِيمَ مُصَلًّى﴾

٢٥٨ – عَنِ ابْنَ عُمَرَ ﷺ، أَنَّهُ سُئِلَ عَنْ رَجُلٍ طَافَ بِالْبَيْتِ الْعُمْرَةَ، وَلَمْ يَطُفْ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ، أَيَأْتِى امْرَأَتَهُ؟ فَقَالَ: قَدِمَ النَّبِىُّ ﷺ فَطَافَ بِالْبَيْتِ سَبْعًا، وَصَلَّى خَلْفَ الْمَقَامِ رَكْعَتَيْنِ، وَطَافَ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ، وَقَدْ كَانَ لَكُمْ فِى رَسُولِ اللَّهِ أُسْوَةٌ حَسَنَةٌ. [رواه البخاري: ٣٩٥]

[1] Cərir ibn Abdullah ﷺ İslamı əl-Maidə surəsinin altıncı ayəsi nazil olduqdan sonra qəbul etmişdi. Bu da məsh çəkməklə bağlı bütün mübahisələrə son qoymuşdur.

[2] "əl-Bəqərə" surəsi, 125.

**258.** İbn Ömərdən ﷺ soruşdular ki, ümrə ziyarətində Kəbəni təvaf etmiş, lakin Səfa[1] və Mərvə[2] arasında gedib-gəlməmiş adam zövcəsi ilə yaxınlıq edə bilərmi? O dedi: "Peyğəmbər ﷺ (Məkkəyə) gəldikdə Kəbəni yeddi dəfə təvaf etdi, (İbrahimin) dayandığı yerin arxasında iki rükət namaz qıldı və Səfa ilə Mərvə arasında gedib-gəldi. Həqiqətən, Allahın elçisi sizin üçün gözəl örnəkdir." (əl-Buxari, 395)

٢٥٩ – عَنْ ابْنَ عَبَّاسٍ رضي الله عنهما، قَالَ: لَمَّا دَخَلَ النَّبِيُّ ﷺ الْبَيْتَ دَعَا فِى نَوَاحِيهِ كُلِّهَا وَلَمْ يُصَلِّ حَتَّى خَرَجَ مِنْهُ، فَلَمَّا خَرَجَ رَكَعَ رَكْعَتَيْنِ فِى قِبَلِ الْكَعْبَةِ وَقَالَ: «هَذِهِ الْقِبْلَةُ». [رواه البخاري: ٣٩٨]

**259.** İbn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ Kəbəyə daxil olduqda onun hər tərəfində dua etdi və oradan çıxanadək namaz qılmadı. Oradan çıxanda üzünü Kəbəyə çevirib iki rükət (namaz) qıldı və: "Qiblə budur"– dedi. (əl-Buxari, 398)

## 24-cü fəsil. (Namaz qılan adamın) harada olursa olsun, üzünü qibləyə çevirməsi

## ٢٤– باب: التَّوَجُّهُ نَحْوَ الْقِبْلَةِ حَيْثُ كَانَ

٢٦٠ – عَنْ الْبَرَاءِ بْنِ عَازِبٍ رضي الله عنه، قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ صَلَّى نَحْوَ بَيْتِ الْمَقْدِسِ سِتَّةَ عَشَرَ أَوْ سَبْعَةَ عَشَرَ شَهْرًا، وَكَانَ رَسُولُ اللَّهِ ﷺ يُحِبُّ أَنْ يُوَجَّهَ إِلَى الْكَعْبَةِ، فَأَنْزَلَ اللَّهُ "قَدْ نَرَى تَقَلُّبَ وَجْهِكَ فِى السَّمَاءِ" فَتَوَجَّهَ نَحْوَ الْكَعْبَةِ، وَقَالَ السُّفَهَاءُ مِنَ النَّاسِ – وَهُمُ الْيَهُودُ – مَا وَلاَّهُمْ عَنْ قِبْلَتِهِمُ الَّتِى كَانُوا عَلَيْهَا "قُلْ لِلَّهِ الْمَشْرِقُ وَالْمَغْرِبُ يَهْدِى مَنْ يَشَاءُ إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ" فَصَلَّى مَعَ النَّبِيِّ ﷺ رَجُلٌ ثُمَّ خَرَجَ بَعْدَ مَا صَلَّى، فَمَرَّ عَلَى قَوْمٍ مِنَ الأَنْصَارِ فِى صَلاَةِ الْعَصْرِ نَحْوَ بَيْتِ الْمَقْدِسِ فَقَالَ: هُوَ يَشْهَدُ أَنَّهُ صَلَّى مَعَ رَسُولِ اللَّهِ ﷺ، وَأَنَّهُ تَوَجَّهَ نَحْوَ الْكَعْبَةِ، فَتَحَرَّفَ الْقَوْمُ حَتَّى تَوَجَّهُوا نَحْوَ الْكَعْبَةِ. [رواه البخاري: ٣٩٩]

**260.** Bəra ibn Azib ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ on altı və ya on yeddi ay Beytülməqdisə tərəf namaz qıldı. Lakin Peyğəmbər ﷺ çox istəyirdi ki, qiblə Kəbəyə tərəf olsun və Allah (bu xüsusda) ayə nazil etdi: "Biz sənin üzünün göyə tərəf çevrildiyini gördük..."[3] Bundan sonra Peyğəmbər ﷺ Kəbəyə tərəf üz tutdu. Səfeh adamlar – yəhudilər dedilər: "Onları üz tutduqları qiblədən döndərən nə oldu?" De: "Məşriq də, məğrib də Allahındır. O, istədiyi kəsi doğru yola yönəldir!"[4] Peyğəmbərlə ﷺ birlikdə bir nəfər namaz qıldı və namazdan sonra (məsciddən) çıxdı və Beytülməqdisə tərəf üz tutub əsr namazını qılan ənsardan olan bir qövmün yanından keçərkən dedi: "Şahidlik edirəm ki, mən Allahın elçisi ilə birlikdə namaz qıldım və o, üzünü Kəbəyə tərəf tutmuşdu. Onlar (bunu eşidən kimi) Kəbəyə tərəf çevrildilər. (əl-Buxari, 399)

٢٦١ – عَنْ جَابِرٍ رضي الله عنه، قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُصَلِّى عَلَى رَاحِلَتِهِ حَيْثُ تَوَجَّهَتْ، فَإِذَا أَرَادَ الْفَرِيضَةَ نَزَلَ فَاسْتَقْبَلَ الْقِبْلَةَ. [رواه البخاري: ٤٠٠]

---

[1] Məscidul-Həramın şərq hissəsində yerləşən iki təpədən birinin adıdır. Zəvvarlar onların arasında mərasim qaçışı yerinə yetirirlər.

[2] Məscidülhəramın şərq hissəsində yerləşmiş iki təpəlikdən biri. Zəvvarlar Səfa və Mərvə təpələri arasında ənənəvi qaçış keçirirlər.

[3] "əl-Bəqərə" surəsi, 144.

[4] "əl-Bəqərə" surəsi, 142.

**261.** Cabir ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ minik üzərində, getdiyi istiqamətə tərəf üz tutaraq namaz qılardı. Fərz namazını qılmaq istədikdə isə yerə enər və qibləyə tərəf üz tutardı. (əl-Buxari, 400)

**٢٦٢** – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﵁، قَالَ: صَلَّى النَّبِيُّ ﷺ فَلَمَّا سَلَّمَ قِيلَ لَهُ: يَا رَسُولَ اللَّهِ، أَحَدَثَ فِي الصَّلَاةِ شَيْءٌ؟ قَالَ: «وَمَا ذَاكَ». قَالُوا: صَلَّيْتَ كَذَا وَكَذَا، فَثَنَى رِجْلَيْهِ وَاسْتَقْبَلَ الْقِبْلَةَ، وَسَجَدَ سَجْدَتَيْنِ ثُمَّ سَلَّمَ، فَلَمَّا أَقْبَلَ عَلَيْنَا بِوَجْهِهِ قَالَ: «إِنَّهُ لَوْ حَدَثَ فِي الصَّلَاةِ شَيْءٌ لَنَبَّأْتُكُمْ بِهِ، وَلَكِنْ إِنَّمَا أَنَا بَشَرٌ مِثْلُكُمْ، أَنْسَى كَمَا تَنْسَوْنَ، فَإِذَا نَسِيتُ فَذَكِّرُونِي، وَإِذَا شَكَّ أَحَدُكُمْ فِي صَلَاتِهِ فَلْيَتَحَرَّى الصَّوَابَ، فَلْيُتِمَّ عَلَيْهِ ثُمَّ يُسَلِّمْ، ثُمَّ يَسْجُدْ سَجْدَتَيْنِ». [رواه البخاري: ٤٠١]

**262.** Abdullah ibn Məsud ﵁ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ namaz qılıb salamları verdikdən sonra ondan soruşdular: “Ey Allahın elçisi, namazda nə isə bir dəyişiklikmi olub?” O: “Nə olub ki?”– deyə soruşdu. (Əshabələr): “Sən namazı filan cür-filan cür qıldın”– dedilər. Onda o, dizlərini yerə qoyub üzünü qibləyə çevirdi və iki dəfə səcdə etdikdən sonra (yenidən) salam verdi. Üzünü bizə tərəf çevirdikdə isə dedi: “Hərgah namazda bir şey baş versəydi, bu haqda mən sizə mütləq xəbər verərdim. Lakin mən də sizin kimi bir insanam, sizin kimi mən də unuduram. Odur ki, unutsam, yadıma salın və əgər sizdən birinizdə qıldığı namazına dair şübhə oyanarsa, qoy daha düz olana meyl edib namazını tamamlasın və salamları versin, sonra da iki dəfə (əlavə) səcdə etsin.” (əl-Buxari, 401)

## 25-ci fəsil. Qiblə haqqında, habelə səhvən qibləyə üz tutmadan namaz qılmış adamın onu təkrar qılmasını vacib saymayan kimsə barəsində

## ٢٥– باب: مَا جَاءَ فِي الْقِبْلَةِ وَمَنْ لاَ يَرَى الإِعَادَةَ عَلَى مَنْ سَهَا فَصَلَّى إِلَى غَيْرِ الْقِبْلَةِ

**٢٦٣** – عَنْ عُمَرَ ﵁ قَالَ: وَافَقْتُ رَبِّي فِي ثَلَاثٍ، فَقُلْتُ: يَا رَسُولَ اللَّهِ، لَوِ اتَّخَذْنَا مِنْ مَقَامِ إِبْرَاهِيمَ مُصَلًّى فَنَزَلَتْ ﴿وَٱتَّخِذُواْ مِن مَّقَامِ إِبْرَٰهِـۧمَ مُصَلًّى﴾ وَآيَةُ الْحِجَابِ، قُلْتُ: يَا رَسُولَ اللَّهِ، لَوْ أَمَرْتَ نِسَاءَكَ أَنْ يَحْتَجِبْنَ، فَإِنَّهُ يُكَلِّمُهُنَّ الْبَرُّ وَالْفَاجِرُ. فَنَزَلَتْ آيَةُ الْحِجَابِ، وَاجْتَمَعَ نِسَاءُ النَّبِيِّ ﷺ فِي الْغَيْرَةِ عَلَيْهِ، فَقُلْتُ لَهُنَّ: ﴿عَسَىٰ رَبُّهُۥٓ إِن طَلَّقَكُنَّ أَن يُبْدِلَهُۥٓ أَزْوَٰجًا خَيْرًا مِّنكُنَّ﴾ فَنَزَلَتْ هَذِهِ الآيَةُ. [رواه البخاري: ٤٠٢]

**263.** Rəvayət edilir ki, Ömər ﵁ demişdir: “Mən üç ayədə Rəbbimə müvafiq oldum. Mən: “Ya Rəsulallah! Bəlkə İbrahimin durduğu yeri namazgah edək?”– dedim, “İbrahimin dayandığı yeri namazgah edin!”[1] ayəsi nazil oldu. Hicab ayəsi[2] də həmçinin. Mən: “Ya Rəsulallah! Bəlkə qadınlarına hicab geyməyi əmr edəsən? Axı onlarla həm möminlər, həm də yaramaz insanlar danışırlar”– dedim, hicab ayəsi nazil oldu. (Üçüncüsünə gəlincə, bir dəfə) Peyğəmbərin ﷺ zövcələri əlbir olub ona qarşı qısqanclıq göstərməyə başladıqda mən onlara: “Əgər o sizi

---

[1] “əl-Bəqərə” surəsi, 125.
[2] “əl-Əhzab” surəsi, 59.

boşasa, Rəbbi sizin əvəzinizə ona sizdən daha yaxşı zövcələr verə bilər"–dedim, bu ayə[1] nazil oldu. (əl-Buxari, 402)

## ٢٦– باب: حَكُّ الْبُزَاقِ بِالْيَدِ مِنَ الْمَسْجِدِ

## 26-cı fəsil. Tüpürcəyin məsciddən əl ilə silinməsi

٢٦٤ – عَنْ أَنَسٍ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ رَأَى نُخَامَةً فِي الْقِبْلَةِ، فَشَقَّ ذَلِكَ عَلَيْهِ حَتَّى رُئِيَ فِي وَجْهِهِ، فَقَامَ فَحَكَّهُ بِيَدِهِ، فَقَالَ «إِنَّ أَحَدَكُمْ إِذَا قَامَ فِي صَلاَتِهِ، فَإِنَّهُ يُنَاجِي رَبَّهُ، أَوْ إِنَّ رَبَّهُ بَيْنَهُ وَبَيْنَ الْقِبْلَةِ، فَلاَ يَبْزُقَنَّ أَحَدُكُمْ قِبَلَ قِبْلَتِهِ، وَلَكِنْ عَنْ يَسَارِهِ، أَوْ تَحْتَ قَدَمَيْهِ»، ثُمَّ أَخَذَ طَرَفَ رِدَائِهِ فَبَصَقَ فِيهِ، ثُمَّ رَدَّ بَعْضَهُ عَلَى بَعْضٍ، فَقَالَ: «أَوْ يَفْعَلْ هَكَذَا». [رواه البخاري: ٤٠٥]

**264.** Ənəs ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ (məscidin) qiblə tərəfində tüpürcək gördü və bu ona o qədər ağır gəldi ki, (üzüldüyü) onun üzündən görünürdü. O, ayağa qalxıb onu əli ilə sildi və dedi: "Sizdən biriniz namaz qılmağa başladıqda öz Rəbbi ilə gizli söhbətə girir, yaxud Rəbbi onunla qiblə arasındadır.[2] Odur ki, sizdən heç kim qiblə tərəfə tüpürməsin, (tüpürmək istəsə) qoy sol tərəfə və ya ayağının altına tüpürsün." Sonra o, öz izarının[3] bir ucunu tutaraq ona tüpürdü və tüpürcəyini izarının digər tərəfi ilə örtüb dedi: "Və ya belə etsin." (əl-Buxari, 405)

## ٢٧– باب: لاَ يَبْصُقْ عَنْ يَمِينِهِ فِي الصَّلاَةِ

## 27-ci fəsil. Namaz əsnasında sağ tərəfə tüpürülməməlidir

٢٦٥ – عَنْ أَبِي هُرَيْرَةَ وَأَبِي سَعِيدٍ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ رَأَى نُخَامَةً فِي جِدَارِ الْمَسْجِدِ، فَتَنَاوَلَ حَصَاةً فَحَكَّهَا فَقَالَ: «إِذَا تَنَخَّمَ أَحَدُكُمْ فَلاَ يَتَنَخَّمَنَّ قِبَلَ وَجْهِهِ وَلاَ عَنْ يَمِينِهِ، وَلْيَبْصُقْ عَنْ يَسَارِهِ أَوْ تَحْتَ قَدَمِهِ الْيُسْرَى». [رواه البخاري: ٤١٠]

**265.** Əbu Hureyra ﷺ və Əbu Səid ﷺ rəvayət edirlər ki, (bir dəfə) Peyğəmbər ﷺ məscidin divarında tüpürcək gördükdə xırda daşlar götürüb onu qazıdı və dedi: "Sizlərdən biri tüpürmək istədikdə, heç vaxt özündən qabağa və ya sağ tərəfə tüpürməsin, ancaq sol tərəfə və ya sol ayağının altına tüpürsün." (əl-Buxari, 410)

## ٢٨– باب: كَفَّارَةُ الْبُزَاقِ فِي الْمَسْجِدِ

## 28-ci fəsil. Məscidə tüpürməyin kəffarəsi[4]

٢٦٦ – عَنْ أَنَسَ بْنَ مَالِكٍ ﷺ، قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «الْبُزَاقُ فِي الْمَسْجِدِ خَطِيئَةٌ، وَكَفَّارَتُهَا دَفْنُهَا». [رواه البخاري: ٤١٥]

---

[1] "ət-Təhrim" surəsi, 5.

[2] Xəttabi bu cümləni izah edib demişdir ki: "Namaz qılan adamın qibləyə tərəf çevrilməkdə məqsədi yalnız Rəbbinə üz tutmaqdır deyə, (Peyğəmbər ﷺ belə tövsiyə etmişdir)." Fəthul Bari, 2/123.

[3] 239-cu hədisin qeydlərinə bax.

[4] Kəffarə – səhvən və ya məcburiyyət qarşısında işlədilən günahın bağışlanması üçün şəriətə uyğun olaraq verilən sədəqə, tutulan oruc və başqa bu kimi yaxşı əməllərdir.

**266.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məscidə tüpürmək günahdır, bu günahın kəffarəsi isə onu basdırmaqdır[1]." (əl-Buxari, 415)

## 29-cu fəsil. İmamın insanlara namazı lazımınca qılmalarına dair, habelə qiblə ilə bağlı öyüd-nəsihəti

## ٢٩– باب: عِظَةُ الإِمَامِ النَّاسَ فِى إِتْمَامِ الصَّلاَةِ، وَذِكْرِ الْقِبْلَةِ

**٢٦٧** – عَن أَبِى هُرَيْرَةَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «هَلْ تَرَوْنَ قِبْلَتِى هَا هُنَا؟ فَوَاللَّهِ مَا يَخْفَى عَلَيَّ خُشُوعُكُمْ وَلاَ رُكُوعُكُمْ، إِنِّى لأَرَاكُمْ مِنْ وَرَاءِ ظَهْرِى». [رواه البخاري: ٤١٨]

**267.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yoxsa siz elə güman edirsiniz ki, mən ancaq bu qibləmi (görürəm)? Allaha and olsun ki, sizin (namazdakı) hərəkətiniz və (necə) rükuya getməyiniz məndən gizli qalmır[2]. Çünki mən sizin arxamda nə etdiyinizi görürəm." (əl-Buxari, 418)

## 30-cu fəsil. "Bəni filan məscidi"[3] demək olarmı?

## ٣٠– باب: هَلْ يُقَالُ مَسْجِدُ بَنِى فُلاَنٍ؟

**٢٦٨** – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ سَابَقَ بَيْنَ الْخَيْلِ الَّتِى أُضْمِرَتْ مِنَ الْحَفْيَاءِ، وَأَمَدُهَا ثَنِيَّةُ الْوَدَاعِ، وَسَابَقَ بَيْنَ الْخَيْلِ الَّتِى لَمْ تُضْمَرْ مِنَ الثَّنِيَّةِ إِلَى مَسْجِدِ بَنِى زُرَيْقٍ، وَإِنَّ عَبْدَ اللَّهِ بْنَ عُمَرَ كَانَ فِيمَنْ سَابَقَ بِهَا. [رواه البخاري: ٤٢٠]

**268.** Adullah ibn Ömər ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ əhliləşdirilmiş atlarda Həfyadan[4] Vədə keçidinə[5] qədər, əhliləşdirilməmiş atlarda isə bu keçiddən Bəni Zürəyq məscidinədək cıdır yarışı təşkil etdi.

Rəvayət edilir ki, yarışlarda Adullah ibn Ömər ﷺ də iştirak edirdi. (əl-Buxari, 420)

## 31-ci fəsil. Məsciddə (mal) bölgüsü və xurma salxımlarının asılması

## ٣١– باب: الْقِسْمَةُ وَتَعْلِيقِ الْقِنْوِ فِى الْمَسْجِدِ

**٢٦٩** – عَن أَنَسٍ ﷺ، قَالَ: أُتِىَ النَّبِىُّ ﷺ بِمَالٍ مِنَ الْبَحْرَيْنِ، فَقَالَ: «انْثُرُوهُ فِى الْمَسْجِدِ». وَكَانَ أَكْثَرَ مَالٍ أُتِىَ بِهِ رَسُولُ اللَّهِ ﷺ، فَخَرَجَ رَسُولُ اللَّهِ ﷺ إِلَى الصَّلاَةِ وَلَمْ يَلْتَفِتْ إِلَيْهِ، فَلَمَّا قَضَى الصَّلاَةَ جَاءَ فَجَلَسَ إِلَيْهِ، فَمَا

---

[1] Bu hökm ancaq döşəməsi torpaqdan olan məscidlərə aiddir.

[2] Bununla Peyğəmbər ﷺ demək istəmişdir ki, namaz vaxtı onun üzü qibləyə tərəf olmuş olsa da, əshabələrin buraxdığı xətalar ondan gizli qalmır.

[3] "Bəni filan" – filankəsin oğulları deməkdir.

[4] Mədinə yaxınlığında yer adıdır.

[5] Dağ keçidinin adıdır.

كَانَ يَرَى أَحَدًا إِلاَّ أَعْطَاهُ، إِذْ جَاءَهُ الْعَبَّاسُ فَقَالَ: يَا رَسُولَ اللَّهِ، أَعْطِنِى فَإِنِّى فَادَيْتُ نَفْسِى وَفَادَيْتُ عَقِيلاً، فَقَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ: «خُذْ». فَحَثَا فِى ثَوْبِهِ، ثُمَّ ذَهَبَ يُقِلُّهُ فَلَمْ يَسْتَطِعْ، فَقَالَ: يَا رَسُولَ اللَّهِ، مُرْ بَعْضَهُمْ يَرْفَعْهُ إِلَيَّ، قَالَ: «لاَ» قَالَ: فَارْفَعْهُ أَنْتَ عَلَيَّ، قَالَ: «لاَ» فَنَثَرَ مِنْهُ، ثُمَّ ذَهَبَ يُقِلُّهُ، فَقَالَ: يَا رَسُولَ اللَّهِ، مُرْ بَعْضَهُمْ يَرْفَعْهُ عَلَيَّ، قَالَ: «لاَ» قَالَ: فَارْفَعْهُ أَنْتَ عَلَيَّ، قَالَ: «لاَ» فَنَثَرَ مِنْهُ، ثُمَّ احْتَمَلَهُ فَأَلْقَاهُ عَلَى كَاهِلِهِ ثُمَّ انْطَلَقَ، فَمَا زَالَ رَسُولُ اللَّهِ ﷺ يُتْبِعُهُ بَصَرَهُ حَتَّى خَفِىَ عَلَيْنَا، عَجَبًا مِنْ حِرْصِهِ، فَمَا قَامَ رَسُولُ اللَّهِ ﷺ وَثَمَّ مِنْهَا دِرْهَمٌ. [رواه البخاري: ٤٢١]

**269.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbərə ﷺ Bəhreyndən pul gətirdilər və o: “Bunu məscidə boşaldın”– deyə buyurdu. Bu, Peyğəmbərə ﷺ nə vaxtsa göndərilmiş ən böyük məbləğ idi. Sonra Peyğəmbər ﷺ namaz qılmağa getdi və heç dönüb pullara baxmadı da. Namazı bitirdikdən sonra gəlib həmin pulların yanında oturdu və gördüyü hər kəsə ondan verdi. Bu vaxt Abbas[1] onun yanına gəlib dedi: “Ya Rəsulallah! Mənə də (bir şey) ver, axı mən həm özüm üçün, həm də Əqil[2] üçün fidyə[3] vermişəm.” Peyğəmbər ﷺ ona: “Götür!”– dedi və o da (dirhəmləri) ovuclayıb paltarının içinə yığmağa başladı. Sonra onu qaldırmaq istədi, lakin gücü çatmadı. Onda o dedi: “Ya Rəsulallah! Birinə de, bunu qaldırıb çiynimə qoysun.” Peyğəmbər ﷺ: “Olmaz!”– dedi. (Abbas): “Elə isə özün onu qaldır qoy çiynimə”– dedi. Peyğəmbər ﷺ (yenə) “Olmaz!”– dedi. Bundan sonra (Abbas ﷺ pulun bir hissəsini) boşaltdı və (yerdə) qalanını qaldırmaq istədi, (lakin gücü çatmadı). O (yenə) dedi: “Ya Rəsulallah! Birinə de, bunu qaldırıb çiynimə qoysun.” Peyğəmbər ﷺ: “Olmaz!”– dedi. (Abbas): “Elə isə özün onu qaldır qoy çiynimə”– dedi. Peyğəmbər ﷺ (yenə): “Olmaz!”– dedi. Belə olduqda (Abbas pulun) bir hissəsini də boşaltdı. Sonra o, bağlamanı qaldırıb çiyninə qoydu və çıxıb getdi. (Abbasın pula olan) hərisliyinə təəccüblənən Peyğəmbər ﷺ o gözdən itənədək onun arxasınca baxdı. Peyğəmbər ﷺ axırıncı dirhəmləri paylayıb qurtarana qədər yerindən qalxmadı. (əl-Buxari, 421)

## 32-ci fəsil. Evlərdə namaz qılınan yerlər

## ٣٢– باب: الْمَسَاجِدُ فِى الْبُيُوتِ

٢٧٠ – عَنْ مَحْمُودِ بْنِ الرَّبِيعِ الأَنْصَارِىُّ ﷺ، أَنَّ عِتْبَانَ بْنَ مَالِكٍ – وَهُوَ مِنْ أَصْحَابِ رَسُولِ اللَّهِ ﷺ مِمَّنْ شَهِدَ بَدْرًا مِنَ الأَنْصَارِ – أَنَّهُ أَتَى رَسُولَ اللَّهِ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ، قَدْ أَنْكَرْتُ بَصَرِى، وَأَنَا أُصَلِّى لِقَوْمِى، فَإِذَا كَانَتِ الأَمْطَارُ سَالَ الْوَادِى الَّذِى بَيْنِى وَبَيْنَهُمْ، لَمْ أَسْتَطِعْ أَنْ آتِىَ مَسْجِدَهُمْ فَأُصَلِّىَ بِهِمْ، وَوَدِدْتُ يَا رَسُولَ اللَّهِ أَنَّكَ تَأْتِينِى فَتُصَلِّىَ فِى بَيْتِى، فَأَتَّخِذَهُ مُصَلًّى، قَالَ: فَقَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ: «سَأَفْعَلُ إِنْ شَاءَ اللَّهُ». قَالَ عِتْبَانُ: فَغَدَا رَسُولُ اللَّهِ ﷺ وَأَبُو بَكْرٍ حِينَ ارْتَفَعَ النَّهَارُ، فَاسْتَأْذَنَ رَسُولُ اللَّهِ ﷺ فَأَذِنْتُ لَهُ، فَلَمْ يَجْلِسْ حَتَّى دَخَلَ الْبَيْتَ ثُمَّ قَالَ: «أَيْنَ تُحِبُّ أَنْ أُصَلِّىَ مِنْ بَيْتِكَ؟» قَالَ: فَأَشَرْتُ لَهُ إِلَى نَاحِيَةٍ مِنَ الْبَيْتِ، فَقَامَ رَسُولُ اللَّهِ ﷺ فَكَبَّرَ، فَقُمْنَا فَصَفَّنَا، فَصَلَّى رَكْعَتَيْنِ ثُمَّ سَلَّمَ، قَالَ: وَحَبَسْنَاهُ عَلَى خَزِيرَةٍ صَنَعْنَاهَا لَهُ، قَالَ فَثَابَ فِى الْبَيْتِ رِجَالٌ مِنَ

---

[1] Abbas ﷺ Peyğəmbərin ﷺ əmisidir.
[2] Əqil Peyğəmbərin ﷺ əmisi oğludur.
[3] Girov tutulmuş, yaxud əsir alınmış bir adamı azad etmək üçün verilən pul və s.

أَهْلِ الدَّارِ ذَوُو عَدَدٍ فَاجْتَمَعُوا، فَقَالَ قَائِلٌ مِنْهُمْ: أَيْنَ مَالِكُ بْنُ الدُّخَيْشِنِ أَوِ ابْنُ الدُّخْشُنِ؟ فَقَالَ بَعْضُهُمْ: ذَلِكَ مُنَافِقٌ لاَ يُحِبُّ اللَّهَ وَرَسُولَهُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «لاَ تَقُلْ ذَلِكَ، أَلاَ تَرَاهُ قَدْ قَالَ: لاَ إِلَهَ إِلاَّ اللَّهُ، يُرِيدُ بِذَلِكَ وَجْهَ اللَّهِ» قَالَ: اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ، قَالَ: فَإِنَّا نَرَى وَجْهَهُ وَنَصِيحَتَهُ إِلَى الْمُنَافِقِينَ، قَالَ رَسُولُ اللَّهِ ﷺ: «فَإِنَّ اللَّهَ قَدْ حَرَّمَ عَلَى النَّارِ مَنْ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، يَبْتَغِي بِذَلِكَ وَجْهَ اللَّهِ». [رواه البخاري: ٤٢٥]

**270.** Mahmud ibn Rabi əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ əshabəsi və Bədr döyüşünün ənsardan olan iştirakçısı İtban ibn Malik Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulallah! Mənim gözlərim zəifləyib. Özüm də qövmümə namaz qıldırıram. Yağış yağdığı zaman mənimlə onların arasında olan vadini su basır deyə, məscidlərinə gedib onlara namaz qıldıra bilmirəm. Ya Rəsulullah! Mən istəyirəm ki, sən bizim evə gəlib orada namaz qılasan, mən də həmin yeri namazgah edim." Peyğəmbər ﷺ ona: "Allah qoysa, mən (bunu) edərəm!"– dedi.

İtban ﷺ dedi: "Ertəsi gün səhər tezdən Peyğəmbər ﷺ Əbu Bəkrlə birlikdə bizə gəldilər. Peyğəmbər ﷺ evə girməyə izn istədi, mən də ona izn verdim. Evə girdikdə oturmadan dərhal soruşdu: "Evin harasında namaz qılım?"

İtban ﷺ dedi: "Mən ona evimdə bir yer göstərdim. Peyğəmbər ﷺ orada durub "Allahu Əkbər"– dedi (və namaz qılmağa başladı). Biz də onun arxasında cərgəyə durduq. O, iki rükət namaz qıldı və salam verib (namazı bitirdi)."

İtban ﷺ dedi: "Biz Peyğəmbəri ﷺ bir qədər yubatdıq ki, onun üçün hazırladığımız xəzirəni[1] (yeyə bilsin). Bu yerin əhalisindən bir çoxları (Peyğəmbərin ﷺ gəlişindən xəbər tutan kimi) gəlib evə doluşdular. Onlardan biri soruşdu: "Malik ibn Duxeyşin (və ya ibn Duxşun) haradadır?" Oradakılardan biri dedi: "O, münafiqdir, Allahı və Onun Elçisini sevmir." Peyğəmbər ﷺ dedi: "Belə demə! Məgər sən bilmirsən ki, o, Allahın Üzünü diləyərək "Lə ilahə illəllah"[2]– demişdir?" (O adam) dedi: "Allah və Onun Elçisi daha yaxşı bilər!" İtban dedi: "Biz onun münafiqlərə qarşı (mehriban) mövqedə olduğunu və onlara məsləhət verdiyini görürük." Peyğəmbər ﷺ dedi: "Allah, həqiqətən də, Onun Üzünü diləyərək "Lə ilahə illəllah" deyən kimsəyə, Cəhənnəm odunun toxunmasını haram etmişdir." (əl-Buxari, 425)

---

[1] Xəzirə – yemək növüdür. Bu yeməyi hazırlamaq üçün xırda-xırda doğranmış ət suda qaynadılmalı və qaynadıldıqdan sonra üstünə un vurulmalıdır.

[2] Təkallahlığın sübutu və şəhadəti. Mənası "Allahdan başqa *ibadətə layiq olan* məbud yoxdur" deməkdir. Müsəlmanlar Uca Allahdan başqa heç kimə ibadət etmirlər. Çünki təkcə Allah ilahi xilqətlər yaratmağa qadirdir və Allaha məxsus həqiqi kamil sifətlərə malik olan da Odur. Əsl müsəlmanlar bütlərə, ulduzlara, müqəddəslərə, peyğəmbərlərə və yaxud mələklərə ibadəti rədd edirlər. Çünki bütün bu saydıqlarımız yaradılmış olub Xaliqə, hər şeyi Yaradan Allaha möhtacdırlar. O isə yenilməz qüdrət və qüvvət Sahibidir və heç kimə və heç nəyə möhtac deyildir. Lakin bu şəhadətə iman gətirmək və müsəlman olmaq üçün yeddi şərt yerinə yetirilməlidir. Əks təqdirdə tövhid şəhadəti o kimsəyə fayda verməz. Bunlar: (1) bu şəhadətin mahiyyəti haqqında bilikdir ki, nadanlıqla bir araya sığmaz; (2) bu şəhadətin doğruluğuna iman gətirməkdir ki, şəkk gətirməklə bir araya sığmaz; (3) qəlblə və dillə bu şəhadətin qəbul edilməsidir ki, onun sözlərini deməkdən boyun qaçırmaqla bir araya sığmaz; (4) bu şəhadətin bütün tələblərinə mütiliklə tabe olmaqdır ki, Allaha və Muhəmməd Peyğəmbərə ﷺ asi olmaqla bir araya sığmaz; (5) bu şəhadəti dilə gətirərkən təbii olan səmimiyyətdir ki, yalanla bir araya sığmaz; (6) bu şəhadətə və onu yerinə yetirənlərə bəslənilən məhəbbətdir ki, tövhidi yerinə yetirənlərə qarşı kin və ikrahla bir araya sığışmaz; (7) Allahdan başqa hər bir şeyə ibadətdən əl çəkməkdir.

## 33-cü fəsil. Cahiliyyə dövrünün müşriklərinin qəbirlərini açmaq və həmin yerləri namazgah etmək olarmı?

## ٣٣– باب: هَلْ تُنْبَشُ قُبُورُ مُشْرِكِي الْجَاهِلِيَّةِ، وَيُتَّخَذُ مَكَانُهَا مَسَاجِدَ

٢٧١ – عَنْ عَائِشَةَ رضي الله عنها، أَنَّ أُمَّ حَبِيبَةَ وَأُمَّ سَلَمَةَ ذَكَرَتَا كَنِيسَةً رَأَيْنَهَا بِالْحَبَشَةِ فِيهَا تَصَاوِيرُ، فَذَكَرَتَا لِلنَّبِيِّ ﷺ فَقَالَ: «إِنَّ أُولَئِكَ إِذَا كَانَ فِيهِمُ الرَّجُلُ الصَّالِحُ فَمَاتَ بَنَوْا عَلَى قَبْرِهِ مَسْجِدًا، وَصَوَّرُوا فِيهِ تِلْكَ الصُّوَرَ، فَأُولَئِكَ شِرَارُ الْخَلْقِ عِنْدَ اللَّهِ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٤٢٧]

**271.** Aişə رضي الله عنها rəvayət edir ki, Ummu Həbibə və Ummu Sələmə Həbəşistanda gördükləri və içərisində rəsmlər olan kilsə haqqında xəbər vermişlər. Onlar (bu haqda) Peyğəmbərə ﷺ xəbər vermiş və o da belə demişdir: "Onlar içərilərindən əməlisaleh bir adam öldükdə onun qəbri üstündə məbəd tikir və (divarlarında) həmin rəsmləri çəkirlər. Qiyamət günü onlar Allah yanında yaradılmışların ən pisi olacaqlar." (əl-Buxari, 427)

٢٧٢ – عَنْ أَنَسٍ رضي الله عنه، قَالَ: قَدِمَ النَّبِيُّ ﷺ الْمَدِينَةَ فَنَزَلَ أَعْلَى الْمَدِينَةِ، فِي حَيٍّ يُقَالُ لَهُمْ بَنُو عَمْرِو بْنِ عَوْفٍ، فَأَقَامَ النَّبِيُّ ﷺ فِيهِمْ أَرْبَعَ عَشْرَةَ لَيْلَةً، ثُمَّ أَرْسَلَ إِلَى بَنِي النَّجَّارِ فَجَاءُوا مُتَقَلِّدِي السُّيُوفِ، كَأَنِّي أَنْظُرُ إِلَى النَّبِيِّ ﷺ عَلَى رَاحِلَتِهِ، وَأَبُو بَكْرٍ رِدْفُهُ، وَمَلأُ بَنِي النَّجَّارِ حَوْلَهُ، حَتَّى أَلْقَى بِفِنَاءِ أَبِي أَيُّوبَ، وَكَانَ يُحِبُّ أَنْ يُصَلِّيَ حَيْثُ أَدْرَكَتْهُ الصَّلَاةُ، وَيُصَلِّي فِي مَرَابِضِ الْغَنَمِ، وَأَنَّهُ أَمَرَ بِبِنَاءِ الْمَسْجِدِ، فَأَرْسَلَ إِلَى مَلإٍ مِنْ بَنِي النَّجَّارِ فَقَالَ: «يَا بَنِي النَّجَّارِ ثَامِنُونِي بِحَائِطِكُمْ هَذَا». قَالُوا: لَا وَاللَّهِ، لَا نَطْلُبُ ثَمَنَهُ إِلَّا إِلَى اللَّهِ، فَقَالَ أَنَسٌ: فَكَانَ فِيهِ مَا أَقُولُ لَكُمْ، قُبُورُ الْمُشْرِكِينَ، وَفِيهِ خَرِبٌ، وَفِيهِ نَخْلٌ، فَأَمَرَ النَّبِيُّ ﷺ بِقُبُورِ الْمُشْرِكِينَ فَنُبِشَتْ، ثُمَّ بِالْخَرِبِ فَسُوِّيَتْ، وَبِالنَّخْلِ فَقُطِعَ، فَصَفُّوا النَّخْلَ قِبْلَةَ الْمَسْجِدِ، وَجَعَلُوا عِضَادَتَيْهِ الْحِجَارَةَ، وَجَعَلُوا يَنْقُلُونَ الصَّخْرَ، وَهُمْ يَرْتَجِزُونَ، وَالنَّبِيُّ ﷺ مَعَهُمْ وَهُوَ يَقُولُ:

اللَّهُمَّ لَا خَيْرَ إِلَّا خَيْرُ الآخِرَهْ ... فَاغْفِرْ لِلأَنْصَارِ وَالْمُهَاجِرَهْ

[رواه البخاري: ٤٢٨]

**272.** Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ Mədinəyə gəldikdə şəhərin üst tərəfində, Amr ibn Auf oğulları yaşadığı məhəllədə qonaq qaldı. Peyğəmbər ﷺ on dörd gün onların arasında qaldıqdan sonra Nəccar oğullarının yanına (adam) göndərdi. Onlar qılınclarını bellərinə bağlayıb onun yanına gəldilər. Peyğəmbər ﷺ dəvəsinin üstündə, Əbu Bəkr onun tərkində və Nəccar oğullarından da bir dəstə onun ətrafında (olduğu halda yola çıxması) hələ də gözümün qabağındadır. Nəhayət, Peyğəmbər ﷺ Əbu Əyyubun evinin həyətində (dəvəsini) yerə çökdürdü. Peyğəmbər ﷺ namaz vaxtı yetişdikdə harada olurdusa orada, hətta, qoyun ağılında belə, namaz qılmağı xoşlayırdı. (Sonra) o, məscid tikməyi əmr etdi, Nəccar oğullarından olan dəstənin arxasınca (adam) göndərdi və dedi: "Ey Nəccar oğulları, bu divarınızın[1] qiymətini mənə deyin!" Onlar dedilər: "Yox! Allaha and olsun ki, biz onun əvəzini ancaq Allahdan istəyirik."

Ənəs رضي الله عنه dedi: "Sizə söylədiyim o yerdə müşriklərin qəbirləri, xarabalıqlar və xurma ağacları var idi. Peyğəmbərin ﷺ əmri ilə qəbirlər açıldı və xarabalıqlar hamarlandı. Xurma ağaclarını isə kəsib (tikiləcək) məscidin qiblə tərəfində

[1] Burada söhbət o divarın yerləşdiyi torpaq sahəsindən gedir.

yanbayan (dik) qoydular. Sonra məscidin (qapısının) yan divarlarını daşdan hördülər və şeir deyə-deyə daş daşımağa başladılar. Peyğəmbər ﷺ də onlarla bərabər (daş daşıyırdı) və deyirdi:

*Allahım, əsl əcr, axirətin əcridi,*
*Ənsar və mühacirə, göstər mərhəmətini!"*

(əl-Buxari, 428)

## ٣٤- باب: الصَّلاَةُ فِى مَوَاضِعِ الإِبِلِ

## 34-cü fəsil. Dəvələrin saxlanıldığı yerdə namaz qılmaq

٢٧٣ – عَنْ ابْنَ عُمَرَ رضي الله عنهما، أَنَّهُ كَانَ يُصَلِّى إِلَى بَعِيرِهِ وَقَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ يَفْعَلُهُ. [رواه البخاري: ٤٣٠]

**273.** İbn Ömər رضي الله عنهما üzünü öz dəvəsinə[1] tərəf tutub namaz qılar və deyərdi: "Mən Peyğəmbərin ﷺ belə etdiyini görmüşəm." (əl-Buxari, 430)

## ٣٥- باب: مَنْ صَلَّى وَقُدَّامَهُ تَنُّورٌ أَوْ نَارٌ أَوْ شَىْءٌ مِمَّا يُعْبَدُ، فَأَرَادَ بِهِ وَجْهَ اللَّهَ تَعَالَى

## 35-ci fəsil. Sobanın, odun və (müşriklərin) ibadət etdiyi şeylərin qarşısında, lakin Allah üçün namaz qılanlar haqqında

٢٧٤ – عَنْ أَنَسٌ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «عُرِضَتْ عَلَيَّ النَّارُ وَأَنَا أُصَلِّى». [رواه البخاري: ٤٣١]

**274.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Namaz əsnasında mənə (cəhənnəmin) odu göstərildi." (əl-Buxari, 431)

## ٣٦- باب: كَرَاهِيَةُ الصَّلاَةِ فِى الْمَقَابِرِ

## 36-cı fəsil. Qəbirlərin arasında namaz qılmağın qadağan olunması

٢٧٥ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنِ النَّبِيِّ ﷺ قَالَ: «اجْعَلُوا فِى بُيُوتِكُمْ مِنْ صَلاَتِكُمْ، وَلاَ تَتَّخِذُوهَا قُبُورًا». [رواه البخاري: ٤٣٢]

**275.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Namazlarınızın bir qismini öz evlərinizdə qılın, onları qəbirlərə çevirməyin." (əl-Buxari, 432)

## ٣٧- باب

## 37-ci fəsil

٢٧٦ – عَنْ عَائِشَةَ وَعَبْدِ اللَّهِ بْنَ عَبَّاسٍ رضي الله عنهم قَالاَ: لَمَّا نَزَلَ بِرَسُولِ اللَّهِ ﷺ طَفِقَ يَطْرَحُ خَمِيصَةً لَهُ عَلَى وَجْهِهِ، فَإِذَا اغْتَمَّ بِهَا كَشَفَهَا عَنْ وَجْهِهِ، فَقَالَ وَهُوَ كَذَلِكَ: «لَعْنَةُ اللَّهِ عَلَى الْيَهُودِ وَالنَّصَارَى اتَّخَذُوا قُبُورَ أَنْبِيَائِهِمْ مَسَاجِدَ». يُحَذِّرُ مَا صَنَعُوا. [رواه البخاري: ٤٣٥]

[1] Burada ibn Ömərin رضي الله عنهما öz dəvəsindən sütrə kimi istifadə etməsi qəsd edilir.

**276.** Aişə və Abdullah ibn Abbas ﷺ rəvayət edirlər ki, Peyğəmbər ﷺ ölümündən qabaq örtüyünü üzünə atmağa başlamışdı. (Ürəyi) sıxıldıqda isə onu üzündən götürürdü. Belə olduğu halda (Peyğəmbər ﷺ) dedi: "Allah yəhudilərə və xristianlara lənət eləsin! Onlar peyğəmbərlərinin qəbirlərini ibadətgaha çevirmişlər." (Peyğəmbər ﷺ bu sözləri ilə ümmətini) onların etdikləindən çəkindirmişdir.) (əl-Buxari, 435)

## 38-ci fəsil. Qadının məsciddə yatması

## ٣٨– باب: نَوْمُ الْمَرْأَةِ فِى الْمَسْجِدِ

٢٧٧ – عَنْ عَائِشَةَ ﷺ، أَنَّ وَلِيدَةً كَانَتْ سَوْدَاءَ لِحَيٍّ مِنَ الْعَرَبِ، فَأَعْتَقُوهَا، فَكَانَتْ مَعَهُمْ قَالَتْ: فَخَرَجَتْ صَبِيَّةٌ لَهُمْ عَلَيْهَا وِشَاحٌ أَحْمَرُ مِنْ سُيُورٍ، قَالَتْ: فَوَضَعَتْهُ أَوْ وَقَعَ مِنْهَا، فَمَرَّتْ بِهِ حُدَيَّاةٌ وَهْوَ مُلْقًى، فَحَسِبَتْهُ لَحْمًا فَخَطِفَتْهُ، قَالَتْ: فَالْتَمَسُوهُ فَلَمْ يَجِدُوهُ، قَالَتْ: فَاتَّهَمُونِى بِهِ، قَالَتْ: فَطَفِقُوا يُفَتِّشُونَ حَتَّى فَتَّشُوا قُبُلَهَا، قَالَتْ: وَاللَّهِ إِنِّى لَقَائِمَةٌ مَعَهُمْ، إِذْ مَرَّتِ الْحُدَيَّاةُ فَأَلْقَتْهُ، قَالَتْ: فَوَقَعَ بَيْنَهُمْ قَالَتْ: فَقُلْتُ هَذَا الَّذِى اتَّهَمْتُمُونِى بِهِ – زَعَمْتُمْ – وَأَنَا مِنْهُ بَرِيئَةٌ، وَهُوَ ذَا هُوَ قَالَتْ: فَجَاءَتْ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَأَسْلَمَتْ. قَالَتْ عَائِشَةُ فَكَانَ لَهَا خِبَاءٌ فِى الْمَسْجِدِ أَوْ حِفْشٌ قَالَتْ: فَكَانَتْ تَأْتِينِى فَتَحَدَّثُ عِنْدِى قَالَتْ: فَلاَ تَجْلِسُ عِنْدِى مَجْلِسًا إِلاَّ قَالَتْ:

وَيَوْمَ الْوِشَاحِ مِنْ أَعَاجِيبِ رَبِّنَا ... أَلاَ إِنَّهُ مِنْ بَلْدَةِ الْكُفْرِ أَنْجَانِى

قَالَتْ عَائِشَةُ: فَقُلْتُ لَهَا: مَا شَأْنُكِ، لاَ تَقْعُدِينَ مَعِى مَقْعَدًا إِلاَّ قُلْتِ هَذَا؟ قَالَتْ: فَحَدَّثَتْنِى بِهَذَا الْحَدِيثِ.

[رواه البخاري: ٤٣٩]

**277.** Aişə ﷺ rəvayət edir ki, ərəb qəbilələrindən birinin qara dərili kölə qadını vardı. (Qadın) azad edildikdən sonra da onların yanında qalmışdı. Qadın dedi. "Bir dəfə mənim kimi bir qızcığaz çiynində qırmızı rəngli dəridən olan, üstünə mirvari düzülmüş bağlama ilə (evdən) bayıra çıxdı. O, əlindəki bağlamanı yerə qoydu (yaxud o, əlindən yerə düşdü). Bundan sonra bir çalağan (bağlamanın) üstündən uçarkən onu yerə düşmüş ət parçası bilib götürdü. Ev əhli bağlamanı axtardı, lakin tapa bilmədi. Sonra onlar məni (oğurluqda) günahlandırdılar, üst-başımı axtardılar, hətta ayıb yerlərimə də baxdılar."

Cariyə dedi: "Vallahi, mən onların yanında dayandığım zaman həmin çalağan (yenə üstümüzdən) uçub bağlamanı (yerə) saldı və o, adamların düz arasına düşdü. Onda mən dedim: "Budur, məni günahlandırdığınız şey, halbuki onun itməsində mən günahkar deyildim, indi o sizin qarşınızdadır."

Aişə ﷺ dedi: "Sonra həmin qadın Peyğəmbərin ﷺ yanına gəlib İslamı qəbul etdi. Məscidin yaxınlığında onun çadırı (və ya balaça bir koması) var idi. O, tez-tez yanıma gəlib mənimlə söhbət edirdi. Qadın (hər dəfə) məni görəndə (belə bir beyt) deyirdi:

*Bağlama itdiyi gün, Rəbbin möcüzəsiydi,*
*Kafirlər diyarından, O, məni xilas etdi.*

Aişə dedi: "Mən ondan soruşdum: "Nə üçün sən hər dəfə mənimlə görüşəndə bu beyti deyirsən?" – o da mənə bu əhvalatı danışdı. (əl-Buxari, 130)

## 39-cu fəsil. Kişilərin məsciddə yatması

## ٣٩– باب: نَوْمُ الرِّجَالِ فِى الْمَسْجِد

٢٧٨ – عَنْ سَهْلِ بْنِ سَعْد ﷺ، قَالَ: جَاءَ رَسُولُ اللَّه ﷺ بَيْتَ فَاطمَةَ، فَلَمْ يَجدْ عَليًّا فى الْبَيْت فَقَالَ: «أَيْنَ ابْنُ عَمِّك». قَالَتْ: كَانَ بَيْنى وَبَيْنَهُ شَىْءٌ، فَغَاضَبَنى فَخَرَجَ فَلَمْ يَقلْ عنْدى. فَقَالَ رَسُولُ اللَّه ﷺ لإنْسَان: «انْظُرْ أَيْنَ هُوَ». فَجَاءَ فَقَالَ: يَا رَسُولَ اللَّه، هُوَ فى الْمَسْجد رَاقدٌ، فَجَاءَ رَسُولُ اللَّه ﷺ وَهْوَ مُضْطَجعٌ، قَدْ سَقَطَ ردَاؤُهُ عَنْ شقِّه، وَأَصَابَهُ تُرَابٌ، فَجَعَلَ رَسُولُ اللَّه ﷺ يَمْسَحُهُ عَنْهُ وَيَقُولُ: «قُمْ أَبَا تُرَابٍ، قُمْ أَبَا تُرَابٍ». [رواه البخاري: ٤٤١]

**278.** Səhl ibn Səd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Fatimənin evinə gəlib Əlini orada tapmadı və: "Əmim oğlu haradadır?"– deyə soruşdu. Fatimə dedi: "Aramızda mübahisə baş verdi, onun mənə açığı tutdu və günorta mənim yanımda yatmaqdan imtina etdi." Peyğəmbər ﷺ bir nəfərə: "Bax, gör, o haradadır"– deyə buyurdu. O (adam) qayıdıb: "Ya Rəsulallah! O, məsciddə yatıb"– dedi. Peyğəmbər ﷺ oraya getdi. (Gördü ki,) Əli böyrü üstə uzanıb, bürüncəyi üstündən sürüşüb düşüb, özü də toza bulaşıb. Peyğəmbər ﷺ: "Qalx, ey Əbu Turab[1], qalx, ey Əbu Turab!"– deyə-deyə onun tozunu çırpmağa başladı. (əl-Buxari, 441)

## 40-cı fəsil. Məscidə daxil olan kəs iki rükət namaz qılmalıdır

## ٤٠– باب: إِذَا دَخَلَ الْمَسْجِدَ فَلْيَرْكَعْ رَكْعَتَيْنِ

٢٧٩ – عَنْ أَبِى قَتَادَةَ السَّلَمِىِّ ﷺ، أَنَّ رَسُولَ اللَّه ﷺ قَالَ: «إِذَا دَخَلَ أَحَدُكُمُ الْمَسْجِدَ فَلْيَرْكَعْ رَكْعَتَيْنِ قَبْلَ أَنْ يَجْلِسَ». [رواه البخاري: ٤٤٤]

**279.** Əbu Qətadə əs-Sələmi ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizlərdən biri məscidə daxil olduğu zaman qoy oturmamışdan əvvəl iki rükət namaz qılsın." (əl-Buxari, 444)

## 41-ci fəsil. Məscidin tikilməsi

## ٤١– باب: بُنْيَانُ الْمَسْجِد

٢٨٠ – عَنْ عَبْد الله بْنِ عُمَرَ ﷺ، قَالَ: إنَّ الْمَسْجدَ كَانَ عَلَى عَهْد رَسُول اللَّه ﷺ مَبْنيًّا باللَّبن، وَسَقْفُهُ الْجَريدُ، وَعُمُدُهُ خَشَبُ النَّخْلِ، فَلَمْ يَزدْ فيه أَبُو بَكْر شَيْئًا، وَزَادَ فيه عُمَرُ وَبَنَاهُ عَلَى بُنْيَانه فى عَهْد رَسُول اللَّه ﷺ باللَّبن وَالْجَريد، وَأَعَادَ عُمُدَهُ خَشَبًا، ثُمَّ غَيَّرَهُ عُثْمَانُ، فَزَادَ فيه زيَادَةً كَثيرَةً، وَبَنَى جدَارَهُ بالْحجَارَة الْمَنْقُوشَة وَالْقَصَّة، وَجَعَلَ عُمُدَهُ منْ حجَارَةٍ مَنْقُوشَةٍ، وَسَقَفَهُ بالسَّاج. [رواه البخاري: ٤٤٦]

**280.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ zamanında məscid kərpicdən tikilmişdi, onun damı xurma ağacının budaqlarından, dirəkləri isə xurma ağacının gövdələrindən hazırlanmışdı. Əbu Bəkr ona heç nə əlavə etmədi. Ömərə gəlincə, o, Peyğəmbərin ﷺ zamanında olduğu kimi (məscidi) kərpic-

---

[1] Əbu Turab "torpaq atası" və ya "torpağa batmış" deməkdir. Peyğəmbər ﷺ ona bu ayamanı verməklə onu əzizləmiş, həqiqi mənada zarafat etmişdir.

lərdən və xurma ağacının budaqlarından tikməklə, dirəklərini də əvvəlki kimi ağacdan düzəltməklə onu genişləndirdi. Sonra Osman (məscidin binasını) dəyişdirdi və onu bir az da genişləndirdi. O, (məscidin) divarlarını yonulmuş daşlarla hördürüb əhənglədi, dirəklərini yonulmuş daşlardan tikdirdi, damını da hind palıdı ilə örtdürdü. (əl-Buxari, 446)

## 42-ci fəsil. Məscid tikilərkən (işçilərin) bir-birinə köməklik etməsi

## ٤٢ – باب: التَّعَاوُنُ فِي بِنَاءِ الْمَسْجِدِ

٢٨١ – عَنْ عِكْرِمَةَ قَالَ لِي ابْنُ عَبَّاسٍ رضي الله عنهما وَلابْنِهِ عَلِيٍّ: انْطَلِقَا إِلَى أَبِي سَعِيدٍ فَاسْمَعَا مِنْ حَدِيثِهِ، فَانْطَلَقْنَا فَإِذَا هُوَ فِي حَائِطٍ يُصْلِحُهُ، فَأَخَذَ رِدَاءَهُ فَاحْتَبَى، ثُمَّ أَنْشَأَ يُحَدِّثُنَا حَتَّى أَتَى ذِكْرُ بِنَاءِ الْمَسْجِدِ، فَقَالَ: كُنَّا نَحْمِلُ لَبِنَةً لَبِنَةً، وَعَمَّارٌ لَبِنَتَيْنِ لَبِنَتَيْنِ، فَرَآهُ النَّبِيُّ ﷺ فَيَنْفُضُ التُّرَابَ عَنْهُ وَيَقُولُ: «وَيْحَ عَمَّارٍ تَقْتُلُهُ الْفِئَةُ الْبَاغِيَةُ، يَدْعُوهُمْ إِلَى الْجَنَّةِ، وَيَدْعُونَهُ إِلَى النَّارِ». قَالَ: يَقُولُ عَمَّارٌ: أَعُوذُ بِاللَّهِ مِنَ الْفِتَنِ. [رواه البخاري: ٤٤٧]

**281.** İkrimə rəvayət edir ki, (bir dəfə) ibn Abbas رضي الله عنهما mənə və oğlu Əliyə dedi: "Əbu Səid əl-Xudrinin yanına gedin və rəvayət etdiyi hədislərə qulaq asın." Biz gedib gördük ki, o, bağda işləyir. O (bizi görən kimi) üst geyimini götürüb ona büründü. Sonra bizə hədis danışmağa başladı. Nəhayət, məscidin tikilməsini xatırladıqda dedi: "Biz kərpicləri bir-bir götürüb daşıyırdıq. Əmmar isə iki-iki (götürürdü). Peyğəmbər ﷺ (Əmmarın canfəşanlığını) görəndə (ona yaxınlaşdı) və onun üstündəki tozu çırpa-çırpa dedi: "Yazıq Əmmar! Onu təcavüzkar bir dəstə öldürəcəkdir. (Əmmar) onları Cənnətə, onlar isə onu Cəhənnəmə çağıracaqlar."

(Əbu Səid رضي الله عنه) dedi: "Əmmar (bu sözləri eşidib) dedi: "Mən bu fitnədən Allaha sığınıram!" (əl-Buxari, 447)

## 43-cü fəsil. Məscid tikənlər haqqında

## ٤٣ – باب: مَنْ بَنَى مَسْجِدًا

٢٨٢ – عَنْ عُثْمَانَ بْنَ عَفَّانَ رضي الله عنه، قَالَ عِنْدَ قَوْلِ النَّاسِ فِيهِ حِينَ بَنَى مَسْجِدَ الرَّسُولِ ﷺ: إِنَّكُمْ أَكْثَرْتُمْ، وَإِنِّي سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «مَنْ بَنَى مَسْجِدًا يَبْتَغِي بِهِ وَجْهَ اللَّهِ، بَنَى اللَّهُ لَهُ مِثْلَهُ فِي الْجَنَّةِ». [رواه البخاري: ٤٥٠]

**282.** Belə rəvayət edir ki, Osman ibn Əffan رضي الله عنه Peyğəmbərin ﷺ məscidini yenidən tikdiyi zaman insanların onun haqqında söylədiklərinə (etiraz edib) demişdir: "Siz (mənim işimə) çox müdaxilə edirsiniz. Halbuki mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim Allahın Üzünü diləyərək bir məscid tiksə, Allah onun üçün Cənnətdə buna bənzər (bir ev) tikər." (əl-Buxari, 450)

## 44-cü fəsil. Məsciddən keçən (adam) oxlarının uclarından tutmalıdır

## ٤٤ – باب: الأَخْذُ بِنُصُولِ النَّبْلِ إِذَا مَرَّ فِي الْمَسْجِدِ

٢٨٣ – عَنْ جَابِرِ بْنَ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: مَرَّ رَجُلٌ فِي الْمَسْجِدِ وَمَعَهُ سِهَامٌ، فَقَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ: «أَمْسِكْ بِنِصَالِهَا». [رواه البخاري: ٤٥١]

**283.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, bir nəfər çiynində oxlar olduğu halda məsciddən keçərkən Peyğəmbər ﷺ ona: "Oxların uclarından tut!"– dedi. (əl-Buxari, 451)

## 45-ci fəsil. Məsciddən keçmək

## ٤٥– باب: الْمُرُورُ فِى الْمَسْجِدِ

٢٨٤ – عَنْ أَبِي مُوسَى الأَشْعَرِيِّ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ مَرَّ فِى شَىْءٍ مِنْ مَسَاجِدِنَا أَوْ أَسْوَاقِنَا بِنَبْلٍ، فَلْيَأْخُذْ عَلَى نِصَالِهَا، لاَ يَعْقِرْ بِكَفِّهِ مُسْلِمًا». [رواه البخاري: ٤٥٢]

**284.** Əbu Musa əl-Əşari ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qoy məscidlərimizin və ya bazarlarımızın birindən üstündə ox olduğu halda keçən hər kəs (əli ilə) oxların ucundan tutsun ki, heç bir müsəlmanı yaralamasın." (əl-Buxari, 452)

## 46-cı fəsil. Məsciddə şeir söyləmək

## ٤٦– باب: الشِّعْرُ فِى الْمَسْجِدِ

٢٨٥ – عَنْ حَسَّانَ بْنِ ثَابِتٍ الأَنْصَارِيِّ ﷺ، أَنَّهُ اسْتَشْهَدَ أَبَا هُرَيْرَةَ: أَنْشُدُكَ اللَّهَ، هَلْ سَمِعْتَ النَّبِيَّ ﷺ يَقُولُ: «يَا حَسَّانُ، أَجِبْ عَنْ رَسُولِ اللَّهِ ﷺ، اللَّهُمَّ أَيِّدْهُ بِرُوحِ الْقُدُسِ» . قَالَ أَبُو هُرَيْرَةَ: نَعَمْ. [رواه البخاري: ٤٥٣]

**285.** Həssan ibn Sabit əl-Ənsari ﷺ rəvayət edir ki, (bir dəfə) o, Əbu Hureyradan soruşdu: "Səni and verirəm Allaha, (de görüm) Peyğəmbərin ﷺ: "Ey Həssan, Allahın elçisinin əvəzinə (müşriklərə) cavab ver! Ey Allah, ona müqəddəs ruhla[1] kömək ol!"– dediyini eşitmisənmi?" Əbu Hureyra: "Bəli!"– deyə cavab verdi. (əl-Buxari, 453)

## 47-ci fəsil. Məsciddə adamların nizə oynatması

## ٤٧– باب: أَصْحَابُ الْحِرَابِ فِى الْمَسْجِدِ

٢٨٦ – عَنْ عَائِشَةَ ﷺ، قَالَتْ: لَقَدْ رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَوْمًا عَلَى بَابِ حُجْرَتِى، وَالْحَبَشَةُ يَلْعَبُونَ فِى الْمَسْجِدِ وَرَسُولُ اللَّهِ ﷺ يَسْتُرُنِى بِرِدَائِهِ، أَنْظُرُ إِلَى لَعِبِهِمْ. وَ فِي رِوَايَةٍ: يَلْعَبُونَ بِحِرَابِهِمْ. [رواه البخاري: ٤٥٤]

**286.** Aişə ﷺ demişdir: "Bir dəfə həbəşilər məsciddə oynayarkən mən Peyğəmbəri ﷺ otağımın qapısı önündə gördüm. Bu vaxt Peyğəmbər ﷺ bürüncəyini qapıya tuturdu ki, mən onların oynamağına baxa bilim.

Digər rəvayətdə deyilir ki, onlar öz nizələri ilə oynayırdılar. (əl-Buxari, 454)

## 48-ci fəsil. Məsciddə (bir məsələyə dair hökmün) verilməsini tələb etmək və məscidə davamiyyətli gəlmək

## ٤٨– باب: التَّقَاضِى وَالْمُلاَزَمَةُ فِى الْمَسْجِدِ

٢٨٧ – عَنْ كَعْبِ بْنِ مَالِكٍ ﷺ، أَنَّهُ تَقَاضَى ابْنَ أَبِى حَدْرَدٍ دَيْنًا كَانَ لَهُ عَلَيْهِ فِى الْمَسْجِدِ، فَارْتَفَعَتْ أَصْوَاتُهُمَا حَتَّى سَمِعَهَا رَسُولُ اللَّهِ ﷺ وَهْوَ فِى بَيْتِهِ، فَخَرَجَ إِلَيْهِمَا حَتَّى كَشَفَ سِجْفَ حُجْرَتِهِ فَنَادَى: «يَا كَعْبُ» قَالَ لَبَّيْكَ

[1] Burada "müqəddəs ruh" deyildikdə Cəbrail ﷺ nəzərdə tutulur.

يَا رَسُولَ اللَّهِ، قَالَ: «ضَعْ مِنْ دَيْنِكَ هَذَا». وَأَوْمَأَ إِلَيْهِ: أَيِ الشَّطْرَ قَالَ: لَقَدْ فَعَلْتُ يَا رَسُولَ اللَّهِ. قَالَ: «قُمْ فَاقْضِهِ». [رواه البخاري: ٤٥٧]

**287.** Kəb ibn Malik ﷺ rəvayət edir ki, (bir dəfə) məsciddə o, ibn Əbu Hədrəddən ona verdiyi borcu qaytarmağı tələb etdi və onlar səslərini qaldırmağa başladılar. Nəhayət, Peyğəmbər ﷺ evində ikən onların səsini eşidib bayıra çıxdı və otağının pərdəsini açıb uca səslə: "Ey Kəb!"– deyə çağırdı. (Kəb): "Əmrinə müntəzirəm, ya Rəsulallah!"– deyə cavab verdi. Peyğəmbər ﷺ əli ilə işarə edib dedi: "Alacağından bu qədərini (yəni yarısını) bağışla." (Kəb) dedi: "Bağışladım, ya Rəsulallah!" Onda Peyğəmbər ﷺ (ibn Əbu Hədrədə): "Qalx, borcunu ödə!"– deyə əmr etdi. (əl-Buxari, 457)

## ٤٩– باب: كَنْسُ الْمَسْجِدِ وَالْتِقَاطِ الْخِرَقِ وَالْقَذَى وَالْعِيدَانِ

## 49-cu fəsil. Məscidi süpürmək və (içindəki) əskiləri, zibili və ağac qırıntılarını yığışdırmaq

٢٨٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، أَنَّ رَجُلاً أَسْوَدَ أَوِ امْرَأَةً سَوْدَاءَ كَانَ يَقُمُّ الْمَسْجِدَ، فَمَاتَ، فَسَأَلَ النَّبِيُّ ﷺ عَنْهُ، فَقَالُوا: مَاتَ. قَالَ: «أَفَلاَ كُنْتُمْ آذَنْتُمُونِي بِهِ دُلُّونِي عَلَى قَبْرِهِ أَوْ قَالَ قَبْرِهَا»، فَأَتَى قَبْرَهُ فَصَلَّى عَلَيْهِ. [رواه البخاري: ٤٥٨]

**288.** Əbu Hureyra ﷺ rəvayət edir ki, məscidi süpürən bir zənci kişi (və ya zənci qadın) öldü. Peyğəmbər ﷺ onun barəsində soruşduqda (əshabələr): "O öldü"– deyə cavab verdilər. O: "Nə üçün mənə bildirməmisiniz? Mənə onun qəbrini göstərin!"– dedikdən sonra onun qəbrinin yanına gəldi və ona cənazə namazı qıldı. (əl-Buxari, 458)

## ٥٠– باب: تَحْرِيمُ تِجَارَةِ الْخَمْرِ فِي الْمَسْجِدِ

## 50-ci fəsil. Məsciddə şərab ticarətinin qadağan olunması

٢٨٩ – عَنْ عَائِشَةَ ﷺ، قَالَتْ: لَمَّا أُنْزِلَ الآيَاتُ مِنْ سُورَةِ الْبَقَرَةِ فِي الرِّبَا، خَرَجَ النَّبِيُّ ﷺ إِلَى الْمَسْجِدِ، فَقَرَأَهُنَّ عَلَى النَّاسِ، ثُمَّ حَرَّمَ تِجَارَةَ الْخَمْرِ. [رواه البخاري: ٤٥٩]

**289.** Aişə ﷺ rəvayət edir ki, "əl-Bəqərə" surəsindəki sələm haqqında ayələr nazil olduqda Peyğəmbər ﷺ məscidə gəlib onları camaata[1] oxudu. Bundan sonra o, şərabın alış-verişini haram buyurdu. (əl-Buxari, 459)

## ٥١– باب: الأَسِيرُ أَوِ الْغَرِيمُ يُرْبَطُ فِي الْمَسْجِدِ

## 51-ci fəsil. Əsir düşmüş və ya borclu olan kimsənin məsciddə əl-ayağının bağlanılması

٢٩٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنَّ عِفْرِيتًا مِنَ الْجِنِّ تَفَلَّتَ عَلَيَّ الْبَارِحَةَ – أَوْ كَلِمَةً نَحْوَهَا – لِيَقْطَعَ عَلَيَّ الصَّلاَةَ، فَأَمْكَنَنِي اللَّهُ مِنْهُ، فَأَرَدْتُ أَنْ أَرْبِطَهُ إِلَى سَارِيَةٍ مِنْ سَوَارِي الْمَسْجِدِ، حَتَّى تُصْبِحُوا وَتَنْظُرُوا إِلَيْهِ كُلُّكُمْ، فَذَكَرْتُ قَوْلَ أَخِي سُلَيْمَانَ: ﴿رَبِّ ٱغْفِرْ لِي وَهَبْ لِي مُلْكًا لَّا يَنۢبَغِي لِأَحَدٍ مِّنۢ بَعْدِيٓ﴾». [رواه البخاري: ٤٦١]

[1] Burada "əl-Bəqərə" surəsinin 275-279-cu ayələri nəzərdə tutulur.

**290.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ dedi: "Dünən cinlərdən çox qüvvətli birisi namazımı yarımçıq kəsmək üçün yanıma gəldi. (Ravi deyir ki: "Yaxud Peyğəmbər ﷺ buna bənzər bir söz söylədi"). Lakin Allah mənə onu tutmağa yardım etdi. Əvvəlcə mən istədim onu məscidin dirəklərindən birinə bağlayım ki, səhər açıldıqda hamınız ona baxa biləsiniz, ancaq qardaşım Suleymanın dediyini xatırladım. (O demişdir): "Ey Rəbbim! Məni bağışla və mənə elə bir səltənət ver ki, məndən sonra heç kimə nəsib olmasın."[1] (əl-Buxari, 461)

## 52-ci fəsil. Məsciddə xəstələr və başqa kəslər üçün çadır qurmaq

## ٥٢– باب: الْخَيْمَةُ فِى الْمَسْجِدِ لِلْمَرْضَى وَغَيْرِهِمْ

٢٩١ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: أُصِيبَ سَعْدٌ يَوْمَ الْخَنْدَقِ فِى الأَكْحَلِ، فَضَرَبَ النَّبِىُّ ﷺ خَيْمَةً فِى الْمَسْجِدِ لِيَعُودَهُ مِنْ قَرِيبٍ، فَلَمْ يَرُعْهُمْ – وَفِى الْمَسْجِدِ خَيْمَةٌ مِنْ بَنِى غِفَارٍ – إِلاَّ الدَّمُ يَسِيلُ إِلَيْهِمْ فَقَالُوا: يَا أَهْلَ الْخَيْمَةِ، مَا هَذَا الَّذِى يَأْتِينَا مِنْ قِبَلِكُمْ فَإِذَا سَعْدٌ يَغْذُو جُرْحُهُ دَمًا، فَمَاتَ فِيهَا. [رواه البخاري: ٤٦٣]

**291.** Aişə رضي الله عنها rəvayət edir ki, Xəndək döyüşü günü Səd (ibn Muazın) qolunun şah damarı kəsilmişdi. Peyğəmbər ﷺ tez-tez ona baş çəksin deyə, məsciddə çadır qurdurdu. Məsciddə Ğifar oğullarına məxsus (başqa bir) çadır da var idi (ki, bu onları narahat etmirdi). Lakin onlara tərəf axan qanı gördükdə təşvişə düşüb dedilər: "Ey çadır əhli! Sizdən bizə tərəf axan (qan) nədir?" Bir də gördülər ki, Sədin yarasından qan axır. (Səd) elə oradaca vəfat etdi. (əl-Buxari, 463)

## 53-cü fəsil. Zəruri halda dəvəni məscidə salmaq

## ٥٣– باب: إِدْخَالُ الْبَعِيرِ فِى الْمَسْجِدِ لِلْعِلَّةِ

٢٩٢ – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها قَالَتْ: شَكَوْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ أَنِّى أَشْتَكِى، قَالَ: «طُوفِى مِنْ وَرَاءِ النَّاسِ وَأَنْتِ رَاكِبَةٌ» فَطُفْتُ، وَرَسُولُ اللَّهِ ﷺ يُصَلِّى إِلَى جَنْبِ الْبَيْتِ، يَقْرَأُ بِالطُّورِ وَكِتَابٍ مَسْطُورٍ. [رواه البخاري: ٤٦٤]

**292.** Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, (həcc ziyarətində) mən xəstəliyimdən Peyğəmbərə ﷺ şikayət etdim. O da: "Dəvəyə minib camaatın arxasınca təvaf et"– dedi. Mən təvaf etdikdə Peyğəmbər ﷺ Kəbənin yanında durub: "And olsun dağa! And olsun yazılmış Kitaba!"[2] oxuyaraq namaz qılırdı. (əl-Buxari, 464)

## 54-cü fəsil

## ٥٤– باب

٢٩٣ – عَنْ أَنَسٍ رضي الله عنه، أَنَّ رَجُلَيْنِ مِنْ أَصْحَابِ النَّبِىِّ ﷺ خَرَجَا مِنْ عِنْدِ النَّبِىِّ ﷺ فِى لَيْلَةٍ مُظْلِمَةٍ، وَمَعَهُمَا مِثْلُ الْمِصْبَاحَيْنِ يُضِيآنِ بَيْنَ أَيْدِيهِمَا، فَلَمَّا افْتَرَقَا صَارَ مَعَ كُلِّ وَاحِدٍ مِنْهُمَا وَاحِدٌ حَتَّى أَتَى أَهْلَهُ. [رواه البخاري: ٤٦٥]

---

[1] "Sad" surəsi, 35.
[2] "ət-Tur" surəsi.

**293.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ əshabələrindən iki nəfər zülmət gecədə onun yanından çıxdılar və onların qarşısında (yollarına) işıq salan, çırağa bənzər iki şey peyda oldu. Onlar bir-birlərindən ayrılandan sonra hər birinin qarşısında, evinə çatana qədər (yolunu işıqlandıran) bir çıraq qaldı. (əl-Buxari, 465)

## ٥٥– باب: الْخَوْخَةُ وَالْمَمَرُّ فِى الْمَسْجِدِ

## 55-ci fəsil. Məsciddə kiçik qapı və keçid

٢٩٤ – عَنْ أَبِى سَعِيدٍ الْخُدْرِىِّ ﷺ قَالَ: خَطَبَ النَّبِىُّ ﷺ فَقَالَ: «إِنَّ اللَّهَ خَيَّرَ عَبْدًا بَيْنَ الدُّنْيَا وَبَيْنَ مَا عِنْدَهُ، فَاخْتَارَ مَا عِنْدَ اللَّهِ». فَبَكَى أَبُو بَكْرٍ رضى الله عنه، فَقُلْتُ فِى نَفْسِى مَا يُبْكِى هَذَا الشَّيْخَ إِنْ يَكُنِ اللَّهُ خَيَّرَ عَبْدًا بَيْنَ الدُّنْيَا وَبَيْنَ مَا عِنْدَهُ فَاخْتَارَ مَا عِنْدَ اللَّهِ، فَكَانَ رَسُولُ اللَّهِ ﷺ هُوَ الْعَبْدَ، وَكَانَ أَبُو بَكْرٍ أَعْلَمَنَا، قَالَ: «يَا أَبَا بَكْرٍ لاَ تَبْكِ، إِنَّ أَمَنَّ النَّاسِ عَلَىَّ فِى صُحْبَتِهِ وَمَالِهِ أَبُو بَكْرٍ، وَلَوْ كُنْتُ مُتَّخِذًا خَلِيلاً مِنْ أُمَّتِى لاَتَّخَذْتُ أَبَا بَكْرٍ، وَلَكِنْ أُخُوَّةُ الإِسْلاَمِ وَمَوَدَّتُهُ، لاَ يَبْقَيَنَّ فِى الْمَسْجِدِ بَابٌ إِلاَّ سُدَّ إِلاَّ بَابُ أَبِى بَكْرٍ». [رواه البخاري: ٤٦٦]

**294.** Əbu Səid əl-Xudri rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ öz xütbəsində demişdir: "Allah bir qula dünya həyatı ilə Öz yanında olan (nemətlər) arasında seçim etmək imkanı verdi və (o qul) Allah yanında olanları seçdi." Əbu Bəkr (bu sözləri eşidəndə) ağladı. Mən öz-özümə dedim: "Əgər Allah bir qula dünya həyatı ilə Öz yanıda olan (nemətlər) arasında seçim etmək imkanı verib və (o qul) Allah yanında olanları seçibsə, onda bu şeyxi ağladan nədir?" (Axırda bəlli oldu ki,) bu qul Peyğəmbərin ﷺ özü imiş. (Həqiqətən də,) Əbu Bəkr bizdən çox bilirdi. (Peyğəmbər ﷺ) dedi: "Ey Əbu Bəkr, ağlama! Həqiqətən, insanlar arasında dostluqda və malını (xərcləməkdə) mənə ən sadiq olanı Əbu Bəkrdir. Əgər mən ümmətimin arasında özümə ən yaxın dost seçməli olsaydım, mütləq Əbu Bəkri seçərdim. Lakin İslamda qardaşlıq və sevgi (bundan da yaxşıdır). Qoy məsciddə Əbu Bəkrin qapısından başqa bütün qapılar qapadılsın!" (əl-Buxari, 466)

٢٩٥ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ، قَالَ خَرَجَ رَسُولُ اللَّهِ ﷺ فِى مَرَضِهِ الَّذِى مَاتَ فِيهِ عَاصِبٌ رَأْسَهُ بِخِرْقَةٍ، فَقَعَدَ عَلَى الْمِنْبَرِ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ثُمَّ قَالَ: «إِنَّهُ لَيْسَ مِنَ النَّاسِ أَحَدٌ أَمَنَّ عَلَىَّ فِى نَفْسِهِ وَمَالِهِ مِنْ أَبِى بَكْرِ بْنِ أَبِى قُحَافَةَ، وَلَوْ كُنْتُ مُتَّخِذًا مِنَ النَّاسِ خَلِيلاً لاَتَّخَذْتُ أَبَا بَكْرٍ خَلِيلاً، وَلَكِنْ خُلَّةُ الإِسْلاَمِ أَفْضَلُ، سُدُّوا عَنِّى كُلَّ خَوْخَةٍ فِى هَذَا الْمَسْجِدِ غَيْرَ خَوْخَةِ أَبِى بَكْرٍ». [رواه البخاري: ٤٦٧]

**295.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ vəfatı ilə nəticələnən xəstəliyə tutulduğu zaman başı sarıqlı halda (məscidə) gəlib minbərdə oturdu. Allaha həmd-səna deyib mədh etdikdən sonra dedi: "Həqiqətən, insanlar arasında canını və malını (fəda etməkdə) mənə Əbu Bəkr ibn Əbu Quhafədən daha sadiq olan başqa birisi yoxdur. Əgər mən insanlar arasında özümə ən yaxın dost seçməli olsaydım, hökmən Əbu Bəkri dost seçərdim. Lakin İslamda qardaşlıq (bundan) əfzəldir. (Elə isə) bu məsciddə Əbu Bəkrin qapısından başqa bütün qapıları bağlayın!" (əl-Buxari, 467)

## 56-cı fəsil. Kəbənin və məscidlərin qapıları və qıfılları

## ٥٦– باب: الأَبْوَابُ وَالْغَلَقِ لِلْكَعْبَةِ وَالْمَسَاجِدِ

٢٩٦ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما، أَنَّ النَّبِيَّ ﷺ قَدِمَ مَكَّةَ، فَدَعَا عُثْمَانَ بْنَ طَلْحَةَ، فَفَتَحَ الْبَابَ، فَدَخَلَ النَّبِيُّ ﷺ وَبِلاَلٌ وَأُسَامَةُ بْنُ زَيْدٍ وَعُثْمَانُ بْنُ طَلْحَةَ، ثُمَّ أُغْلِقَ الْبَابُ، فَلَبِثَ فِيهِ سَاعَةً ثُمَّ خَرَجُوا. قَالَ ابْنُ عُمَرَ: فَبَدَرْتُ فَسَأَلْتُ بِلاَلاً فَقَالَ: صَلَّى فِيهِ. فَقُلْتُ: فِي أَيٍّ؟ قَالَ: بَيْنَ الأُسْطُوَانَتَيْنِ. قَالَ ابْنُ عُمَرَ: فَذَهَبَ عَلَيَّ أَنْ أَسْأَلَهُ كَمْ صَلَّى. [رواه البخاري: ٤٦٨]

**296.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Məkkəyə gəldikdə[1] Osman ibn Təlhəni (yanına) çağırdı. Osman رضي الله عنه (Kəbənin) qapısını açdı və Peyğəmbər ﷺ, Bilal, Üsamə ibn Zeyd və Osman ibn Təlhə içəri girdilər. Sonra qapılar bağlandı. Peyğəmbər ﷺ (əshabələrilə birlikdə) Kəbənin içində bir müddət qaldıqdan sonra bayıra çıxdılar."

İbn Ömər dedi: "Mən dərhal Bilala yaxınlaşıb (Peyğəmbərin ﷺ nə etdiyini) soruşdum. (Bilal): "İçəridə namaz qıldı"– deyə cavab verdi. Mən: "Harada?"– deyə soruşdum. (Bilal:) "İki sütunun arasında"– deyə cavab verdi.

İbn Ömər رضي الله عنهما dedi: "Ondan neçə rükət qıldığını soruşmaq yadımdan çıxdı." (əl-Buxari, 468)

## 57-ci fəsil. Məsciddə halqa qurmaq və oturmaq

## ٥٧– باب: الْحِلَقُ وَالْجُلُوسِ فِي الْمَسْجِدِ

٢٩٧ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما، قَالَ: سَأَلَ رَجُلٌ النَّبِيَّ ﷺ وَهُوَ عَلَى الْمِنْبَرِ: مَا تَرَى فِي صَلاَةِ اللَّيْلِ؟ قَالَ: «مَثْنَى مَثْنَى، فَإِذَا خَشِيَ الصُّبْحَ صَلَّى وَاحِدَةً، فَأَوْتَرَتْ لَهُ مَا صَلَّى». وَإِنَّهُ كَانَ يَقُولُ اجْعَلُوا آخِرَ صَلاَتِكُمْ وِتْرًا، فَإِنَّ النَّبِيَّ ﷺ أَمَرَ بِهِ. [رواه البخاري: ٤٧٢]

**297.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ minbərdə ikən bir nəfər (ondan) soruşdu: "Gecə namazı haqqında nə deyə bilərsən?" O dedi: "(Onu) iki-iki (qılmalı), dan yerinin sökülməsindən ehtiyat etdiyi zaman bir (rükət də) qılmalıdır ki, öncəki namazlarla (bir yerdə onların) sayı tək olsun."

İbn Ömər رضي الله عنهما deyərdi: "Gecə namazınızı bir rükətlə tamamlayın, çünki Peyğəmbər ﷺ belə buyurmuşdur." (əl-Buxari, 472)

## 58-ci fəsil. Məsciddə arxası üstə uzanmaq

## ٥٨– باب: الاِسْتِلْقَاءُ فِي الْمَسْجِدِ

٢٩٨ – عَنْ عَبْدِ اللهِ بْنِ زَيْدٍ الأَنْصَارِيِّ رضي الله عنه، أَنَّهُ رَأَى رَسُولَ اللَّهِ ﷺ مُسْتَلْقِيًا فِي الْمَسْجِدِ، وَاضِعًا إِحْدَى رِجْلَيْهِ عَلَى الأُخْرَى. [رواه البخاري: ٤٧٥]

**298.** Abdullah ibn Zeyd əl-Ənsari رضي الله عنه rəvayət edir ki, o, Peyğəmbərin ﷺ arxası üstə uzanıb bir ayağını o biri ayağının üstünə qoyduğunu görmüşdür. (əl-Buxari, 475)

[1] Bu hadisə Məkkə fəth edildiyi vaxt baş vermişdir.

## 59-cu fəsil. Bazar məscidində namaz qılmaq

## ٥٩– باب: الصَّلاَةُ فِى مَسْجِدِ السُّوقِ

٢٩٩ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «صَلاَةُ الْجَمِيعِ تَزِيدُ عَلَى صَلاَتِهِ فِى بَيْتِهِ، وَصَلاَتِهِ فِى سُوقِهِ خَمْسًا وَعِشْرِينَ دَرَجَةً، فَإِنَّ أَحَدَكُمْ إِذَا تَوَضَّأَ فَأَحْسَنَ وَأَتَى الْمَسْجِدَ، لاَ يُرِيدُ إِلاَّ الصَّلاَةَ، لَمْ يَخْطُ خُطْوَةً إِلاَّ رَفَعَهُ اللَّهُ بِهَا دَرَجَةً، وَحَطَّ عَنْهُ خَطِيئَةً، حَتَّى يَدْخُلَ الْمَسْجِدَ، وَإِذَا دَخَلَ الْمَسْجِدَ كَانَ فِى صَلاَةٍ مَا كَانَتْ تَحْبِسُهُ، وَتُصَلِّى – يَعْنِى عَلَيْهِ – الْمَلاَئِكَةُ مَا دَامَ فِى مَجْلِسِهِ الَّذِى يُصَلِّى فِيهِ اللَّهُمَّ اغْفِرْ لَهُ، اللَّهُمَّ ارْحَمْهُ، مَا لَمْ يُحْدِثْ فِيهِ». [رواه البخاري: ٤٧٧]

**299.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(İnsanın) camaatla qıldığı namazı öz evində və ya bazarda (fərdi şəkildə) qıldığı namazdan iyirmi beş dəfə artıqdır[1]. Çünki sizlərdən biri lazımı qaydada dəstəmaz alıb ancaq namaz qılmaq məqsədilə məscidə gəlsə, məscidə daxil olanadək atdığı hər addıma görə Allah onu bir dərəcə yüksəldər və onun bir günahını silər. Məscidə daxil olduqdan sonra orada qaldığı vaxt ərzində namazda olduğu kimi sayılar. Namazını qılacağı yerdə gözlədiyi vaxt ərzində, dəstəmazı pozulanadək mələklər: "Allahım, onu bağışla! Allahım, ona rəhm et!"– deyə onun üçün dua edirlər. (əl-Buxari, 477)

## 60-cı fəsil. Məsciddə və başqa yerlərdə barmaqları bir-birinə keçirtmək

## ٦٠– باب: تَشْبِيكُ الأَصَابِعِ فِى الْمَسْجِدِ وَغَيْرِهِ

٣٠٠ – عَنْ أَبِى مُوسَى ﷺ، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «إِنَّ الْمُؤْمِنَ لِلْمُؤْمِنِ كَالْبُنْيَانِ، يَشُدُّ بَعْضُهُ بَعْضًا». وَ شَبَّكَ أَصَابِعَهُ. [رواه البخاري: ٤٨١]

**300.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ: "Möminlər bir bina kimidirlər, bir-birilərini dəstəkləyirlər"– dedi və barmaqlarını bir-birinə keçirtdi." (əl-Buxari, 481)

٣٠١ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: صَلَّى بِنَا رَسُولُ اللَّهِ ﷺ إِحْدَى صَلاَتَىِ الْعَشِىِّ، قَالَ فَصَلَّى بِنَا رَكْعَتَيْنِ ثُمَّ سَلَّمَ، فَقَامَ إِلَى خَشَبَةٍ مَعْرُوضَةٍ فِى الْمَسْجِدِ فَاتَّكَأَ عَلَيْهَا، كَأَنَّهُ غَضْبَانُ، وَوَضَعَ يَدَهُ الْيُمْنَى عَلَى الْيُسْرَى، وَشَبَّكَ بَيْنَ أَصَابِعِهِ، وَوَضَعَ خَدَّهُ الأَيْمَنَ عَلَى ظَهْرِ كَفِّهِ الْيُسْرَى، وَخَرَجَتِ السَّرَعَانُ مِنْ أَبْوَابِ الْمَسْجِدِ فَقَالُوا: قَصُرَتِ الصَّلاَةُ. وَفِى الْقَوْمِ أَبُو بَكْرٍ وَعُمَرُ، فَهَابَا أَنْ يُكَلِّمَاهُ، وَفِى الْقَوْمِ رَجُلٌ فِى يَدَيْهِ طُولٌ يُقَالُ لَهُ: ذُو الْيَدَيْنِ، قَالَ: يَا رَسُولَ اللَّهِ، أَنَسِيتَ أَمْ قَصُرَتِ الصَّلاَةُ؟ قَالَ: «لَمْ أَنْسَ، وَلَمْ تُقْصَرْ» فَقَالَ: «أَكَمَا يَقُولُ ذُو الْيَدَيْنِ؟» فَقَالُوا: نَعَمْ، فَتَقَدَّمَ فَصَلَّى مَا تَرَكَ، ثُمَّ سَلَّمَ، ثُمَّ كَبَّرَ وَسَجَدَ مِثْلَ سُجُودِهِ أَوْ أَطْوَلَ، ثُمَّ رَفَعَ رَأْسَهُ وَكَبَّرَ، ثُمَّ كَبَّرَ وَسَجَدَ مِثْلَ سُجُودِهِ أَوْ أَطْوَلَ، ثُمَّ رَفَعَ رَأْسَهُ وَكَبَّرَ، ثُمَّ سَلَّمَ. [رواه البخاري: ٤٨٢]

**301.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ bizə axşam namazlarından birini qıldırdı. O bizə iki rükət qıldırdıqdan sonra salam verdi. Bundan sonra məscidin içində köndələninə qoyulmuş ağac parçasına dirsəkləndi. Özü də sanki qəzəblənmişdi. Sonra o, sağ əlini sol əlinin üstünə qoyub barmaqlarını

---

[1] Burada söhbət namazın savabından gedir.

bir-birinə keçirtdi və sağ yanağını sol əlinin arxasına söykədi. Tez getmək istəyənlər məscidin qapılarından çıxdılar və: "Namaz qısaldı"– dedilər. (Məsciddəki) camaatın arasında Əbu Bəkr və Ömər də var idi. (Lakin) onlar Peyğəmbərə ﷺ söz deməkdən çəkindilər. Camaatın arasında qolları uzun olduğu üçün Zul-Yədeyn deyilən bir nəfər də var idi. (Həmin adam): "Ya Rəsulallah, unutdunmu? Yoxsa namaz qısalmışdır?"– deyə soruşdu. Peyğəmbər ﷺ: "Mən (heç nə) unutmamışam, namaz da qısaldılmayıb?"– dedi və (camaatdan) soruşdu ki: "Zülyədeyn dediyi kimidirmi?" Onlar: "Bəli"– deyə cavab verdikdə o (qalxıb) qabağa keçdi və buraxdığı (rükətləri) qıldıqdan sonra salamları verdi. Bundan sonra o: "Allahu Əkbər"– deyib səcdəyə getdi və həmişəki qədər, yaxud bir az da uzun müddət səcdədə qaldı. Sonra başını qaldırıb: "Allahu Əkbər"– dedi. Sonra yenə: "Allahu Əkbər"– deyib səcdəyə getdi və həmişəki qədər, yaxud bir az da uzun müddət səcdədə qaldı. Sonra başını qaldırıb: "Allahu Əkbər"– dedi. Sonra salamları verdi. (əl-Buxari, 482)

## ٦١– باب: الْمَسَاجِدُ الَّتِى عَلَى طُرُق الْمَدِينَة وَالْمَوَاضِعُ الَّتِى صَلَّى فِيهَا النَّبِىُّ ﷺ

## 61-ci fəsil. Mədinəyə gedən yolların üstündəki məscidlər və Peyğəmbərin ﷺ namaz qıldığı yerlər

٣٠٢ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما ، أَنَّهُ كَانَ يُصَلِّى فِى أَمَاكِنَ مِنَ الطَرِيقِ وَ يَقُولُ: إِنَّهُ رَأَى النَّبِيَّ ﷺ يُصَلِّى فِى تِلْكَ الأَمْكِنَةِ. [رواه البخاري: ٤٨٣]

**302.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما (Mədinəyə gedən) yolda (başqa-başqa) yerlərdə namaz qılardı və deyərdi ki, Peyğəmbərin ﷺ də həmin yerlərdə namaz qıldığını görmüşdür. (əl-Buxari, 483)

٣٠٣ – عَنْهُ رضي الله عنهما ، أَنَّ رَسُولَ اللَّه ﷺ كَانَ يَنْزلُ بذى الْحُلَيْفَة حينَ يَعْتَمرُ، وَفى حَجَّته حينَ حَجَّ، تَحْتَ سَمُرَة فى مَوْضعِ الْمَسْجد الَّذى بذى الْحُلَيْفَة، وَكَانَ إذَا رَجعَ منْ غَزْو، كَانَ فى تلْكَ الطَّرِيق أَوْ حَجٍّ أَوْ عُمْرَة، هَبَطَ منْ بَطْنِ وَاد، فَإذَا ظَهَرَ منْ بَطْنِ وَاد أَنَاخَ بالْبَطْحَاء الَّتى عَلَى شَفير الْوَادى الشَّرْقيَّة، فَعَرَّسَ ثَمَّ حَتَّى يُصْبحَ، لَيْسَ عنْدَ الْمَسْجد الَّذى بحجَارَة، وَلاَ عَلَى الأَكَمَة الَّتى عَلَيْهَا الْمَسْجدُ، كَانَ ثَمَّ خَليجٌ يُصَلِّى عَبْدُ اللَّه عنْدَهُ، فى بَطْنه كُثُبٌ كَانَ رَسُولُ اللَّه ﷺ ثَمَّ يُصَلِّى، فَدَحَا السَّيْلُ فيه بالْبَطْحَاء حَتَّى دَفَنَ ذَلكَ الْمَكَانَ الَّذى كَانَ عَبْدُ اللَّه يُصَلِّى فيه. [رواه البخاري: ٤٨٤]

**303.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ ümrə və həcc ziyarətinə gedərkən zül-Hüleyfədə (ummu-ğeylan deyilən) tikanlı bir ağacın altında – (sonradan tikilmiş) məscidin yerində dayanardı. Döyüşdən yaxud ümrə və ya həcc ziyarətlərindən həmin yolla qayıdarkən (Əqiq) vadisinin içindən keçər, oradan yuxarı qalxdıqda isə öz dəvəsini nə məscidin yanında, nə də o məscidin olduğu təpənin üstündə deyil, vadinin şərq tərəfindəki daşlıq sahədə yerə çökdürər və orada dincəlmək üçün səhərə qədər dayanardı.

Abdullah ibn Ömər məcrasında qum təpələri olan vadidə namaz qılardı. Əvvəllər o yerdə Peyğəmbər ﷺ namaz qılarmış. Sonralar (vadidən axan) sellər Abdullah ibn Ömərin namaz qıldığı təpələri yuyub yerlə bərabər etmişdi. (əl-Buxari, 484)

٣٠٤ – وَ حَدَّثَ عَبْدُ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما ، أَنَّ النَّبِيَّ ﷺ صَلَّى حَيْثُ الْمَسْجِدُ الصَّغِيرُ الَّذى دُونَ الْمَسْجِدِ الَّذى بِشَرَفِ الرَّوْحَاءِ، وَقَدْ كَانَ عَبْدُ اللَّهِ يَعْلَمُ الْمَكَانَ الَّذى كَانَ صَلَّى فِيهِ النَّبِيُّ ﷺ يَقُولُ: ثَمَّ عَنْ يَمِينِكَ حِينَ تَقُومُ فِى الْمَسْجِدِ تُصَلِّى، وَذَلِكَ الْمَسْجِدُ عَلَى حَافَةِ الطَّرِيقِ الْيُمْنَى، وَأَنْتَ ذَاهِبٌ إِلَى مَكَّةَ، بَيْنَهُ وَبَيْنَ الْمَسْجِدِ الأَكْبَرِ رَمْيَةٌ بِحَجَرٍ أَوْ نَحْوُ ذَلِكَ. [رواه البخاري: ٤٨٥]

**304.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Şərəf ər-Rovhədəki[1] məscidin yanındakı kiçik məscidin yerində namaz qılardı. Abdullah Peyğəmbərin ﷺ namaz qıldığı yerin harada olduğunu bildirib deyərdi: “Orada məsciddə namaza durduğun zaman həmin yer sənin sağ tərəfində qalar. O məscid Məkkə istiqamətində yolun sağ tərəfində yerləşir. Onunla böyük məscidin arasında (əllə) atılmış daş qədər yaxud buna yaxın bir məsafə vardır.” (əl-Buxari, 485)

٣٠٥ – كَانَ عَبْدَ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما يُصَلِّى إِلَى الْعِرْقِ الَّذى عِنْدَ مُنْصَرَفِ الرَّوْحَاءِ، وَذَلِكَ الْعِرْقُ انْتِهَاءُ طَرَفِهِ عَلَى حَافَةِ الطَّرِيقِ، دُونَ الْمَسْجِدِ الَّذى بَيْنَهُ وَبَيْنَ الْمُنْصَرَفِ، وَأَنْتَ ذَاهِبٌ إِلَى مَكَّةَ، وَقَدِ ابْتُنِىَ ثَمَّ مَسْجِدٌ، فَلَمْ يَكُنْ عَبْدُ اللَّهِ يُصَلِّى فِى ذَلِكَ الْمَسْجِدِ، كَانَ يَتْرُكُهُ عَنْ يَسَارِهِ وَوَرَاءَهُ، وَيُصَلِّى أَمَامَهُ إِلَى الْعِرْقِ نَفْسِهِ، وَكَانَ عَبْدُ اللَّهِ يَرُوحُ مِنَ الرَّوْحَاءِ، فَلاَ يُصَلِّى الظُّهْرَ حَتَّى يَأْتِىَ ذَلِكَ الْمَكَانَ فَيُصَلِّى فِيهِ الظُّهْرَ، وَإِذَا أَقْبَلَ مِنْ مَكَّةَ فَإِنْ مَرَّ بِهِ قَبْلَ الصُّبْحِ بِسَاعَةٍ أَوْ مِنْ آخِرِ السَّحَرِ عَرَّسَ حَتَّى يُصَلِّىَ بِهَا الصُّبْحَ. [رواه البخاري: ٤٨٦]

**305.** (Rəvayət edilir ki,) Abdullah ibn Ömər رضي الله عنهما Rovhənin çıxacağında üzünü İrq vadisinə tərəf çevirib namaz qılardı. Bu vadinin qurtaracağı məscidin yanındakı yolun kənarına birləşirdi və Məkkəyə doğru getdikdə həmin vadi ilə Rovhənin çıxacağı arasında qalırdı. Orada bir məscid tikilmişdi. Lakin Abdullah ibn Ömər o məsciddə namaz qılmazdı. Onu özündən sol tərəfdə arxada qoyaraq üzünü İrq vadisinə tərəf çevirib namaz qılardı. O, Rovhədən çıxarkən həmin yerə gəlib çatanadək zöhr namazını qılmaz, bu namazı məhz orada qılardı. Məkkədən qayıtdıqda oradan sübh çağına bir saat qalmış yaxud dan yerinin ağarmasına yaxın keçərdisə, orada sübh namazını qılanadək dayanardı. (əl-Buxari, 486)

٣٠٦ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَنْزِلُ تَحْتَ سَرْحَةٍ ضَخْمَةٍ دُونَ الرُّوَيْثَةِ عَنْ يَمِينِ الطَّرِيقِ، وَوِجَاهَ الطَّرِيقِ فِى مَكَانٍ بَطْحٍ سَهْلٍ، حَتَّى يُفْضِىَ مِنْ أَكَمَةٍ دُوَيْنَ بَرِيدِ الرُّوَيْثَةِ بِمِيلَيْنِ، وَقَدِ انْكَسَرَ أَعْلاَهَا ، فَانْثَنَى فِى جَوْفِهَا، وَهِىَ قَائِمَةٌ عَلَى سَاقٍ، وَفِى سَاقِهَا كُثُبٌ كَثِيرَةٌ. [رواه البخاري: ٤٨٧]

**306.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Ruveysənin[2] yaxınlığında, yolun sağ tərəfindəki düzəngahda (bitmiş) böyük bir ağacın altında dincəlmək üçün dayanardı. (Bu ağac) Ruveysədə qasidlərin dayandığı yerdən təxminən iki mil aralıda yerləşən təpənin arxasında bitmişdi. Bu ağacın yuxarısı qırılmış, içi oyulmuş, özü gövdəsi üstə qalmış, dibində də çoxlu qum təpəcikləri var idi. (əl-Buxari, 487)

٣٠٧ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ صَلَّى فِى طَرَفِ تَلْعَةٍ مِنْ وَرَاءِ الْعَرْجِ وَأَنْتَ ذَاهِبٌ إِلَى هَضْبَةٍ عِنْدَ ذَلِكَ الْمَسْجِدِ قَبْرَانِ أَوْ ثَلاَثَةٌ، عَلَى الْقُبُورِ رَضْمٌ مِنْ حِجَارَةٍ عَنْ يَمِينِ الطَّرِيقِ، عِنْدَ سَلَمَاتِ الطَّرِيقِ، بَيْنَ أُولَئِكَ السَّلَمَاتِ كَانَ عَبْدُ اللَّهِ يَرُوحُ مِنَ الْعَرْجِ بَعْدَ أَنْ تَمِيلَ الشَّمْسُ بِالْهَاجِرَةِ، فَيُصَلِّى الظُّهْرَ فِى ذَلِكَ الْمَسْجِدِ. [رواه البخاري: ٤٨٨]

---

[1] Bu, Mədinənin yetmiş kilometrliyində yerləşən bir kənddir.
[2] Ruveysə, Mədinənin yüz kilometrliyində yerləşən bir kənddir.

**307.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Ərc kəndinin arxasındakı yüksəklikdə, çox hündür olmayan dağ istiqamətindəki sel yatağının kənarında namaz qılardı. (Sonradan) orada tikilmiş məscidin yanında iki və ya üç qəbir var ki, onların üstünə böyük daşlar qoyulmuşdur və onlar yolun sağ tərəfində bitmiş ağacların arasındadır. Abdullah günəş zeniti keçdikdən sonra Ərcdən çıxar və zöhr namazını həmin məsciddə qılardı. (əl-Buxari, 488)

٣٠٨ – قَالَ عَبْدُ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما : وَ نَزَلَ رَسُولَ اللَّهِ عِنْدَ سَرَحَاتٍ عَنْ يَسَارِ الطَّرِيقِ، فِى مَسِيلٍ دُونَ هَرْشَى، ذَلِكَ الْمَسِيلُ لاَصِقٌ بِكُرَاعِ هَرْشَى، بَيْنَهُ وَبَيْنَ الطَّرِيقِ قَرِيبٌ مِنْ غَلْوَةٍ، وَكَانَ عَبْدُ اللَّهِ يُصَلِّى إِلَى سَرْحَةٍ، هِىَ أَقْرَبُ السَّرَحَاتِ إِلَى الطَّرِيقِ وَهْىَ أَطْوَلُهُنَّ. [رواه البخاري: ٤٨٩]

**308.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Hərşa dağının[1] yaxınlığındakı vadinin məcrasındakı yolun solunda ağacların yanında dayanardı. Bu vadi Hərşa dağının ətəyinə birləşir. Vadi ilə yol arasındakı (məsafə) atılmış oxun uçduğu məsafəyə bərabərdir. Abdullah bu ağacların ən uzununa və yola ən yaxın olanına doğru namaz qılardı. (əl-Buxari, 489)

٣٠٩ – وَ يَقُولُ ابْنُ عُمَرَ رضي الله عنهما : إِنَّ النَّبِىَّ ﷺ كَانَ يَنْزِلُ فِى الْمَسِيلِ الَّذِى فِى أَدْنَى مَرِّ الظَّهْرَانِ، قِبَلَ الْمَدِينَةِ حِينَ يَهْبِطُ مِنَ الصَّفْرَاوَاتِ يَنْزِلُ فِى بَطْنِ ذَلِكَ الْمَسِيلِ عَنْ يَسَارِ الطَّرِيقِ، وَأَنْتَ ذَاهِبٌ إِلَى مَكَّةَ، لَيْسَ بَيْنَ مَنْزِلِ رَسُولِ اللَّهِ ﷺ وَبَيْنَ الطَّرِيقِ إِلاَّ رَمْيَةٌ بِحَجَرٍ. [رواه البخاري: ٤٩٠]

**309.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ (Məkkədən) Mədinəyə gedən yolun üstündəki Mərruz-Zəhran vadisinin[2] aşağı tərəfində dayanardı. Yolçu Səfravatdan[3] çıxanda əgər Məkkəyə gedirsə, yolun sol tərəfində yerləşən bu vadidən keçir. Peyğəmbərin ﷺ dayandığı yerlə yolun arasındakı məsafə isə (əllə) atılmış daşın uçub düşdüyü məsafəyə bərabərdir. (əl-Buxari, 490)

٣١٠ – قَالَ عَبْدُ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما : كَانَ النَّبِىَّ ﷺ يَنْزِلُ بِذِى طُوًى وَيَبِيتُ حَتَّى يُصْبِحَ، يُصَلِّى الصُّبْحَ حِينَ يَقْدَمُ مَكَّةَ، وَمُصَلَّى رَسُولِ اللَّهِ ﷺ ذَلِكَ عَلَى أَكَمَةٍ غَلِيظَةٍ، لَيْسَ فِى الْمَسْجِدِ الَّذِى بُنِىَ ثَمَّ، وَلَكِنْ أَسْفَلَ مِنْ ذَلِكَ عَلَى أَكَمَةٍ غَلِيظَةٍ. [رواه البخاري: ٤٩١]

**310.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Məkkəyə gələrkən Zu-Tuva vadisində[4] dayanıb gecəni orada keçirər və səhər açılanda sübh namazını qılardı. Peyğəmbərin ﷺ namaz qıldığı həmin yer (o vadidə) sonradan məscid tikilmiş yerdə deyil, ondan aşağıda böyük bir təpədə yerləşir. (əl-Buxari, 491)

٣١١ – وَ أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ رضي الله عنهما حَدَّثَ: أَنَّ النَّبِىَّ ﷺ اسْتَقْبَلَ فُرْضَتَىِ الْجَبَلِ الَّذِى بَيْنَهُ وَبَيْنَ الْجَبَلِ الطَّوِيلِ نَحْوَ الْكَعْبَةِ، فَجَعَلَ الْمَسْجِدَ الَّذِى بُنِىَ ثَمَّ يَسَارَ الْمَسْجِدِ بِطَرَفِ الأَكَمَةِ، وَمُصَلَّى النَّبِىِّ ﷺ أَسْفَلَ مِنْهُ عَلَى الأَكَمَةِ السَّوْدَاءِ، تَدَعُ مِنَ الأَكَمَةِ عَشَرَةَ أَذْرُعٍ أَوْ نَحْوَهَا، ثُمَّ تُصَلِّى مُسْتَقْبِلَ الْفُرْضَتَيْنِ مِنَ الْجَبَلِ الَّذِى بَيْنَكَ وَبَيْنَ الْكَعْبَةِ. [رواه البخاري: ٤٩٢]

**311.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ (namaz qılarkən) üzünü Kəbə istiqamətində yerləşən hündür dağ arasındakı iki keçidə tərəf çevirərdi.

---

[1] Bu dağ Mədinəyə və Şama gedən yolun birləşdiyi yerdə, Cühfə yaxınlığında yerləşir.
[2] Bu vadi Məkkənin otuz kilometrliyində yerləşir.
[3] Səfravat, Məkkə ilə Mədinə arasında Mərruz-Zəhran vadisinə yaxın bir yer adıdır.
[4] Bu vadi Məkkə yaxınlığında yerləşir.

(İbn Ömər namaza durduğu zaman və sonralar) orada tikilmiş məscid təpənin kənarındakı məscidin sol tərəfində qalırdı. Peyğəmbərin ﷺ namaz qıldığı yer isə bu məsciddən aşağıdakı qara təpədə yerləşir. O təpədən on ərəş[1] aralandıqdan sonra səninlə Kəbə arasında yerləşən dağın iki keçidinə tərəf üz tutub namaz qıla bilərsən. (əl-Buxari, 492)

# أَبْوَابُ سُتْرَةِ الْمُصَلِّي

# **Namaz qılanın** (qoyduğu) **sütrəyə dair fəsillər**

## ١– باب: باب سُتْرَةُ الإِمَامِ سُتْرَةُ مَنْ خَلْفَهُ

## 1-ci fəsil. İmamın sütrəsi onun arxasında dayananlar üçün də sütrədir.

**٣١٢** – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا خَرَجَ يَوْمَ الْعِيدِ أَمَرَ بِالْحَرْبَةِ فَتُوضَعُ بَيْنَ يَدَيْهِ، فَيُصَلِّى إِلَيْهَا وَالنَّاسُ وَرَاءَهُ، وَكَانَ يَفْعَلُ ذَلِكَ فِى السَّفَرِ، فَمِنْ ثَمَّ اتَّخَذَهَا الأُمَرَاءُ. [رواه البخاري: ٤٩٤]

**312.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ bayram günü (namaza) çıxdığı zaman (xidmətçisinə) qısa bir nizə gətirib onun qarşısında (yerə) basdırmağı əmr edərdi. Sonra üzünü bu nizəyə tərəf tutub namaz qılar, camaat da onun arxasında namaza durardı. Peyğəmbər ﷺ bunu səfərdə də edərdi.

Elə buna görə də əmirlər (bayram namazlarına çıxarkən özləri ilə) nizə daşıyardılar. (əl-Buxari, 494)

**٣١٣** – عَنْ أَبِي جُحَيْفَةَ رضي الله عنه، أَنَّ النَّبِيَّ ﷺ صَلَّى بِهِمْ بِالْبَطْحَاءِ – وَبَيْنَ يَدَيْهِ عَنَزَةٌ – الظُّهْرَ رَكْعَتَيْنِ، وَالْعَصْرَ رَكْعَتَيْنِ، تَمُرُّ بَيْنَ يَدَيْهِ الْمَرْأَةُ وَالْحِمَارُ. [رواه البخاري: ٤٩٥]

**313.** Əbu Cuheyfə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ Bəthada[2] qarşısında (yerə sancılmış) bir paya olduğu halda (camaata) iki rükət zöhr namazını və iki rükət əsr namazını qıldırdı. (Peyğəmbər ﷺ namazda ikən) qadınlar və uzunqulaqlar onun qabağından keçərdi. (əl-Buxari, 495)

## ٢– باب: قَدْرُ كَمْ يَنْبَغِى أَنْ يَكُونَ بَيْنَ الْمُصَلِّى وَالسُّتْرَةِ

## 2-ci fəsil. Namaz qılanla sütrə arasındakı məsafə nə qədər olmalıdır?

**٣١٤** – عَنْ سَهْلٍ رضي الله عنه قَالَ: كَانَ بَيْنَ مُصَلَّى رَسُولِ اللَّهِ ﷺ وَبَيْنَ الْجِدَارِ مَمَرُّ الشَّاةِ . [رواه البخاري: ٤٩٦]

**314.** Səhl ibn Səd رضي الله عنهما rəvayət edir ki, Peyğəmbərin ﷺ namaz qıldığı yerlə (qiblə istiqamətindəki) divar arasında bir qoyun keçə biləcək qədər məsafə olardı. (əl-Buxari, 496)

---

[1] Dirsəkdən barmaqların ucuna qədər uzunluqda olan qədim ölçü.

[2] Məkkə yaxınlığındakı daşlıq yerdir.

## 3-cü fəsil. (Yerə sancılmış) ucu iti ağac parçasına doğru namaz qılmaq

## ٣- باب: الصَّلاَةُ إِلَى الْعَنَزَةِ

٣١٥ – عَنْ أَنَسَ بْنَ مَالِك ﷺ، قَالَ كَانَ النَّبِىُّ ﷺ إِذَا خَرَجَ لِحَاجَتِه تَبِعْتُهُ أَنَا وَغُلاَمٌ وَمَعَنَا عُكَّازَةٌ أَوْ عَصًا أَوْ عَنَزَةٌ وَمَعَنَا إِدَاوَةٌ، فَإِذَا فَرَغَ مِنْ حَاجَتِه نَاوَلْنَاهُ الإِدَاوَةَ. [رواه البخاري: ٥٠٠]

**315.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna çıxarkən mən bir uşaqla birgə əlimizdə ağac parçası, yaxud bir əsa və ya bir paya və bir qab su ilə onun ardınca gedər, o, təbii ehtiyacını rəf etdikdən sonra qabı ona verərdik. (əl-Buxari, 500)

## 4-cü fəsil. Sütuna doğru namaz qılmaq

## ٤- باب: الصَّلاَةُ إِلَى الأُسْطُوَانَةِ

٣١٦ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ: أَنَّهُ كَانَ يُصَلِّى عِنْدَ الأُسْطُوَانَةِ الَّتِى عِنْدَ الْمُصْحَفِ، فَقُلْتُ يَا أَبَا مُسْلِمٍ أَرَاكَ تَتَحَرَّى الصَّلاَةَ عِنْدَ هَذِهِ الأُسْطُوَانَةِ. قَالَ فَإِنِّى رَأَيْتُ النَّبِىَّ ﷺ يَتَحَرَّى الصَّلاَةَ عِنْدَهَا. [رواه البخاري: ٥٠٢]

**316.** (Yezid ibn Əbu Ubeyd rəvayət edir ki,) Sələmə ibn Əkva ﷺ (çox vaxt) Quran olan[1] sütunun yanında namaz qılardı. Mən dedim: "Ey Əbu Muslim, mən sənin həmişə bu sütunun yanında namaz qıldığını görürəm." O dedi: "Mən Peyğəmbərin ﷺ çox vaxt onun yanında namaz qıldığını görmüşəm." (əl-Buxari, 502)

## 5-ci fəsil. Sütunlar arasında fərdi namaz qılmaq

## ٥- باب: الصَّلاَةُ بَيْنَ السَّوَارِى فِى غَيْرِ جَمَاعَةٍ

٣١٧ – عَنْ عَبْدِ اللَّه بْنِ عُمَرَ ﷺ، أَنَّ رَسُولَ اللَّه ﷺ دَخَلَ الْكَعْبَةَ وَأُسَامَةُ بْنُ زَيْد وَبِلاَلٌ وَعُثْمَانُ بْنُ طَلْحَةَ الْحَجَبِىُّ فَأَغْلَقَهَا عَلَيْه وَمَكَثَ فِيهَا، فَسَأَلْتُ بِلاَلاً حِينَ خَرَجَ مَا صَنَعَ النَّبِىُّ ﷺ قَالَ جَعَلَ عَمُودًا عَنْ يَسَارِه، وَعَمُودًا عَنْ يَمِينِه، وَثَلاَثَةَ أَعْمِدَة وَرَاءَهُ، وَكَانَ الْبَيْتُ يَوْمَئِذ عَلَى سِتَّةِ أَعْمِدَةٍ، ثُمَّ صَلَّى. وَقَالَ لَنَا إِسْمَاعِيلُ حَدَّثَنِى مَالِكٌ وَقَالَ عَمُودَيْنِ عَنْ يَمِينِه. [رواه البخاري: ٥٠٥]

**317.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Kəbəyə daxil oldu və (onunla birgə) Üsamə ibn Zeyd, Bilal və Osman ibn Təlhə əl-Həcəbi də (oraya daxil oldular), bundan sonra (Osman ibn Təlhə ﷺ) Kəbənin qapısını bağladı və Peyğəmbər ﷺ (bir müddət) orada qaldı. Bilal ﷺ bayıra çıxanda mən ondan: "Peyğəmbər ﷺ orada nə etdi?"- deyə soruşdum. O dedi: "(Peyğəmbər ﷺ orada) sol tərəfində bir sütun, sağ tərəfində bir sütun və arxa tərəfində üç sütun qaldığı halda namaz qıldı.

O vaxt (müqəddəs) Ev altı sütun üzərində idi.

Digər hədisdə (Bilal) "sağ tərəfində iki sütun" olduğunu demişdir. (əl-Buxari, 505)

---

[1] Burada Quranın xüsusi qutuda saxlanıldığı sütun nəzərdə tutulur.

### 6-cı fəsil. (Sütrə məqsədilə) dişi dəvə, dəvə, ağac və yəhərə doğru namaz qılmaq

### ٦– باب: الصَّلَاةُ إِلَى الرَّاحِلَةِ وَالْبَعِيرِ وَالشَّجَرِ وَالرَّحْلِ

٣١٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما، عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ كَانَ يُعَرِّضُ رَاحِلَتَهُ فَيُصَلِّي إِلَيْهَا، قُلْتُ أَفَرَأَيْتَ إِذَا هَبَّتِ الرِّكَابُ، قَالَ كَانَ يَأْخُذُ هَذَا الرَّحْلَ فَيُعَدِّلُهُ فَيُصَلِّي إِلَى آخِرَتِهِ – أَوْ قَالَ مُؤَخَّرِهِ – وَكَانَ ابْنُ عُمَرَ رضي الله عنهما يَفْعَلُهُ. [رواه البخاري: ٥٠٧]

**318.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ dəvəsini yerə çökdürüb ona tərəf namaz qılardı.

(Nafi deyir ki, mən ibn Ömərdən رضي الله عنهما)soruşdum: “De görüm, əgər dəvə ayağa qalxarsa (onda necə olsun)?” O dedi: “(Belə olduğu halda) Peyğəmbər ﷺ yəhəri götürüb qarşısına qoyar və onun arxa tərəfinə üz tutaraq namaz qılardı.”

İbn Ömər رضي الله عنهما də belə edərdi. (əl-Buxari, 507)

### 7-ci fəsil. Çarpayıya doğru namaz qılmaq

### ٧– باب: الصَّلَاةُ إِلَى السَّرِيرِ

٣١٩ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: أَعَدَلْتُمُونَا بِالْكَلْبِ وَالْحِمَارِ لَقَدْ رَأَيْتُنِي مُضْطَجِعَةً عَلَى السَّرِيرِ، فَيَجِيءُ النَّبِيُّ ﷺ فَيَتَوَسَّطُ السَّرِيرَ فَيُصَلِّي، فَأَكْرَهُ أَنْ أُسَنِّحَهُ فَأَنْسَلُّ مِنْ قِبَلِ رِجْلَيِ السَّرِيرِ حَتَّى أَنْسَلَّ مِنْ لِحَافِي. [رواه البخاري: ٥٠٨]

**319.** Aişə رضي الله عنها demişdir: “Siz bizi it və eşşək ilə eynimi tutursunuz?[1] Halbuki, mən yatağımda uzanmış ikən Peyğəmbər ﷺ gəlib üzünü yatağın ortasına tərəf tutub namaz qılardı. Mən (ayağa qalxmaq istədikdə) onunla üzbəüz gəlməyim deyə, taxtın ayaq tərəfindən astaca sürüşüb yorğanımın altından çıxardım. (əl-Buxari, 508)

### 8-ci fəsil. Namaz qılan kəs, önündən keçən adamı itələməlidir

### ٨– باب: يَرُدُّ الْمُصَلِّي مَنْ مَرَّ بَيْنَ يَدَيْهِ

٣٢٠ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ رضي الله عنه، أَنَّهُ كَانَ يُصَلِّي فِي يَوْمِ جُمُعَةٍ إِلَى شَيْءٍ يَسْتُرُهُ مِنَ النَّاسِ، فَأَرَادَ شَابٌّ مِنْ بَنِي أَبِي مُعَيْطٍ أَنْ يَجْتَازَ بَيْنَ يَدَيْهِ فَدَفَعَ أَبُو سَعِيدٍ فِي صَدْرِهِ، فَنَظَرَ الشَّابُّ فَلَمْ يَجِدْ مَسَاغًا إِلاَّ بَيْنَ يَدَيْهِ، فَعَادَ لِيَجْتَازَ فَدَفَعَهُ أَبُو سَعِيدٍ أَشَدَّ مِنَ الْأُولَى، فَنَالَ مِنْ أَبِي سَعِيدٍ، ثُمَّ دَخَلَ عَلَى مَرْوَانَ فَشَكَا إِلَيْهِ مَا لَقِيَ مِنْ أَبِي سَعِيدٍ، وَدَخَلَ أَبُو سَعِيدٍ خَلْفَهُ عَلَى مَرْوَانَ فَقَالَ مَا لَكَ وَلاِبْنِ أَخِيكَ يَا أَبَا سَعِيدٍ قَالَ سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «إِذَا صَلَّى أَحَدُكُمْ إِلَى شَيْءٍ يَسْتُرُهُ مِنَ النَّاسِ، فَأَرَادَ أَحَدٌ أَنْ يَجْتَازَ بَيْنَ يَدَيْهِ فَلْيَدْفَعْهُ، فَإِنْ أَبَى فَلْيُقَاتِلْهُ، فَإِنَّمَا هُوَ شَيْطَانٌ». [رواه البخاري: ٥٠٩]

---

[1] Rəvayətlərin birində deyilir ki, Əsvəd ibn Yezid: “Qadın, it və ya eşşək namaz qılanın qarşısından keçərsə, namazı batil edər”– demiş, Aişə رضي الله عنها də ona etirazını bildirmişdir.

**320.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ cümə günü (qarşısından) heç kəs keçməsin deyə bir sütrəyə doğru namaz qılarkən əbu Muit qəbiləsindən olan bir cavan oğlan onun önündən keçmək istədi. Əbu Səid onu sinəsindən vurub (kənara) itələdi. Cavan oğlan ətrafa nəzər saldı, lakin onun önündən başqa (keçməyə) bir yol tapmadı. Odur ki, yenidən (onun qabağından) keçməyə cəhd göstərdi. (Bu dəfə) Əbu Səid onu əvvəlkindən də qüvvətlə itələdi. Belə olduğu təqdirdə, o, Əbu Səidi söydü, sonra da (Mədinə valisi olan) Mərvanın yanına gedib Əbu Səidin onunla kobud davranmasından şikayət etdi. Əbu Səid onun dalınca Mərvanın yanına gəldi və (Mərvan) ondan: "Ey Əbu Səid, səninlə qardaşın oğlu arasında nə baş verib?"– deyə soruşdu. Əbu Səid dedi: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Sizdən biriniz (önündən) keçən olmasın deyə sütrəyə doğru namaz qıldığı zaman kimsə onun qabağından keçmək istəsə, qoy onu itələsin, əgər tərslik edərsə, qoy onunla vuruşsun, çünki o, şeytandır." (əl-Buxari, 509)

## 9-cu fəsil. Namaz qılanın qabağından keçməyin günahı

## ٩– باب: إِثْمُ الْمَارِّ بَيْنَ يَدَى الْمُصَلِّى

٣٢١ – عَنْ أَبِى جُهَيْمٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لَوْ يَعْلَمُ الْمَارُّ بَيْنَ يَدَى الْمُصَلِّى مَاذَا عَلَيْهِ لَكَانَ أَنْ يَقِفَ أَرْبَعِينَ خَيْرًا لَهُ مِنْ أَنْ يَمُرَّ بَيْنَ يَدَيْهِ». قَالَ الرَّاوِي: لاَ أَدْرِى، أَقَالَ أَرْبَعِينَ يَوْمًا أَوْ شَهْرًا أَوْ سَنَةً. [رواه البخاري: ٥١٠]

**321.** Əbu Cuheym ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Namaz qılanın önündən keçən kimsə nə (qədər günah) qazandığını bilsəydi, (yəqin edərdi ki,) qırx (il, yaxud qırx ay və ya qırx gün yerində) dayanmaq onun üçün namaz qılanın önündən keçməkdən daha yaxşıdır."

Hədisi rəvayət edən (Malik ibn Ənəs) demişdir: "Mən onun qırx gün, yaxud qırx ay və ya qırx il dediyini bilmirəm." (əl-Buxari, 510)

## 10-cu fəsil. Yatan adamın arxasında namaz qılmaq

## ١٠– باب: الصَّلاَةُ خَلْفَ النَّائِمِ

٣٢٢ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: كَانَ النَّبِىُّ ﷺ يُصَلِّى وَأَنَا رَاقِدَةٌ مُعْتَرِضَةٌ عَلَى فِرَاشِهِ، فَإِذَا أَرَادَ أَنْ يُوتِرَ أَيْقَظَنِى فَأَوْتَرْتُ. [رواه البخاري: ٥١٢]

**322.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ adətən, mən onun yatağında uzanıb yatmış ikən (mənə doğru) namaz qılardı. Vitr namazını qılmaq istədikdə isə məni oyadardı və mən də vitr namazını (onunla birlikdə) qılardım. (əl-Buxari, 512)

## 11-ci fəsil. (Namaz qılan adamın) namaz əsnasında körpə qız uşağını qucağında tutması

## ١١– باب: إِذَا حَمَلَ جَارِيَةً صَغِيرَةً عَلَى عُنُقِهِ فِى الصَّلاَةِ

٣٢٣ – عَنْ أَبِى قَتَادَةَ الأَنْصَارِىِّ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يُصَلِّى وَهُوَ حَامِلٌ أُمَامَةَ بِنْتَ زَيْنَبَ بِنْتِ رَسُولِ اللَّهِ ﷺ وَلأَبِى الْعَاصِ بْنِ الرَّبِيعِ بْنِ عَبْدِ شَمْسٍ، فَإِذَا سَجَدَ وَضَعَهَا، وَإِذَا قَامَ حَمَلَهَا. [رواه البخاري: ٥١٦]

**323.** Əbu Qətadə əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ qızı Zeynəbin, Əbul-As ibnur-Rəbi ibn Abduş-Şəmsdən olan qızı Umaməni qucağında tutaraq namaz qılardı. Peyğəmbər ﷺ səcdəyə gedəndə onu yerə qoyar, ayağa qalxanda isə (yenə) onu qucağına alardı. (əl-Buxari, 516)

## 12-ci fəsil. Qadın namaz qılan kimsəyə əziyyət verən şeyi ondan təmizləyir

## ١٢– باب: الْمَرْأَةُ تَطْرَحُ عَنِ الْمُصَلِّى شَيْئًا مِنَ الأَذَى

٣٢٤ – عَنْ عَبْد الله ابْنِ مَسْعُود ﷺ قَالَ: بَيْنَمَا رَسُولُ اللَّه ﷺ قَائمٌ يُصَلِّى عنْدَ الْكَعْبَة، وَجَمْعُ قُرَيْشٍ فِى مَجَالِسهِمْ إِذْ قَالَ قَائلٌ منْهُمْ أَلاَ تَنْظُرُونَ إِلَى هَذَا الْمُرَائِى أَيُّكُمْ يَقُومُ إِلَى جَزُورِ آلِ فُلاَنٍ، فَيَعْمدُ إِلَى فَرْثهَا وَدَمهَا وَسَلاَهَا فَيَجِىءُ به، ثُمَّ يُمْهلُهُ حَتَّى إِذَا سَجَدَ وَضَعَهُ بَيْنَ كَتفَيْه فَانْبَعَثَ أَشْقَاهُمْ ، فَلَمَّا سَجَدَ رَسُولُ اللَّه ﷺ وَضَعَهُ بَيْنَ كَتفَيْه، وَثَبَتَ النَّبِىُّ ﷺ سَاجدًا، فَضَحكُوا حَتَّى مَالَ بَعْضُهُمْ إِلَى بَعْضٍ منَ الضَّحك، فَانْطَلَقَ مُنْطَلقٌ إِلَى فَاطمَةَ عَلَيْهَا السَّلاَمُ وَهِىَ جُوَيْرِيَةٌ، فَأَقْبَلَتْ تَسْعَى وَثَبَتَ النَّبِىُّ ﷺ سَاجدًا حَتَّى أَلْقَتْهُ عَنْهُ، وَأَقْبَلَتْ عَلَيْهِمْ تَسُبُّهُمْ، فَلَمَّا قَضَى رَسُولُ اللَّه ﷺ الصَّلاَةَ قَالَ: «اللَّهُمَّ عَلَيْكَ بقُرَيْشٍ، اللَّهُمَّ عَلَيْكَ بقُرَيْشٍ، اللَّهُمَّ عَلَيْكَ بقُرَيْشٍ – ثُمَّ سَمَّى – اللَّهُمَّ عَلَيْكَ بعَمْرِو بْنِ هشَامٍ، وَعُتْبَةَ بْنِ رَبِيعَةَ، وَشَيْبَةَ بْنِ رَبِيعَةَ، وَالْوَلِيدِ بْنِ عُتْبَةَ، وَأُمَيَّةَ بْنِ خَلَفٍ، وَعُقْبَةَ بْنِ أَبِى مُعَيْطٍ، وَعُمَارَةَ بْنِ الْوَلِيدِ». قَالَ عَبْدُ اللَّه: فَوَاللَّه لَقَدْ رَأَيْتُهُمْ صَرْعَى يَوْمَ بَدْرٍ، ثُمَّ سُحِبُوا إِلَى الْقَلِيبِ قَلِيبِ بَدْرٍ، ثُمَّ قَالَ رَسُولُ اللَّه ﷺ: «وَأُتْبِعَ أَصْحَابُ الْقَلِيبِ لَعْنَةً». [رواه البخاري: ٥٢٠]

**324.** Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Kəbənin yanında durub namaz qılırdı, bir dəstə qureyşli də (yaxınlıqda) məclis qurub oturmuşdu. Birdən onlardan biri dedi: "Bu riyakarı görmürsünüzmü?! Hansı biriniz filan qəbilənin (yenicə kəsdiyi) dəvənin yanına gedib, onun mədəsindən çıxanı, qanını və döl qişasını gətirər, sonra (bu riyakar) səcdəyə gedənədək gözləyər və (o səcdədə ikən) bunu onun kürəkləri arasına qoyar? Onların ən bədbəxti oraya gedib (o murdar şeyləri gətirdi) və Peyğəmbər ﷺ səcdəyə qapıldığı zaman bunu onun kürəkləri arasına qoydu. Peyğəmbər ﷺ səcdəyə qapandığı vəziyyətdə qaldı. Müşriklər gülüşdülər, hətta gülməkdən bir-birinin üstünə yıxılmağa başladılar. Bu arada bir nəfər Fatimə əleyhəssəlamın dalınca getdi. O zaman o, hələ balaca qız idi. O tələsik qaçıb (oraya) gəldi. Peyğəmbər ﷺ isə hələ də səcdədə idi. Nəhayət, Fatimə onun belini təmizlədi, sonra da qureyşlilərə tərəf dönüb, onlara təhqiramiz sözlər deməyə başladı. Peyğəmbər ﷺ namazı bitirdikdən sonra dedi: "Allahım, qureyşlilərin bəlasını ver! Allahım, qureyşlilərin bəlasını ver! Allahım, qureyşlilərin bəlasını ver!" Sonra bir-bir onların adlarını sadalayıb dedi: "Allahım, Amr ibn Hişamın, Utbə ibn Rəbiənin, Şeybə ibn Rəbiənin, Vəlid ibn Utbənin, Umeyyə ibn Xələfin, Uqbə ibn Əbu Muitin və Umarə ibn Vəlidin bəlasını ver!"

Abdullah ibn Məsud ﷺ dedi: "Allaha and olsun ki, mən Bədr günü onların hamısını (öldürülüb) yerə sərilmiş vəziyyətdə gördüm, sonra onları sürükləyib Bədrdə yerləşən (köhnə) bir quyuya atdılar." Bundan sonra Peyğəmbər ﷺ dedi: "Quyuya atılanlar lənətə gəldilər." (əl-Buxari, 520)

# ٩ – كِتَابُ مَوَاقِيتِ الصَّلاةِ

# 9 – Namazların vaxtları kitabı

## 1-ci fəsil. Namazın vaxtları və onun fəziləti

## ١ – باب: مَوَاقِيتُ الصَّلاَةِ وَفَضْلُهَا

٣٢٥ – عَنْ أَبِي مَسْعُود الأَنْصَارِيِّ ﷺ أَنَّهُ دَخَلَ عَلَي الْمُغيرَةَ بْنَ شُعْبَةَ وَ قَدْ أَخَّرَ الصَّلاَةَ يَوْمًا وَهُوَ بِالْعِرَاقِ، فَقَالَ: مَا هَذَا يَا مُغيرَةُ، أَلَيْسَ قَدْ عَلمْتَ أَنَّ جبْريلَ نَزَلَ فَصَلَّى، فَصَلَّى رَسُولُ اللَّه ﷺ ثُمَّ صَلَّى فَصَلَّى رَسُولُ اللَّه ﷺ ثُمَّ صَلَّى فَصَلَّى رَسُولُ اللَّه ﷺ ثُمَّ صَلَّى فَصَلَّى رَسُولُ اللَّه ﷺ ثُمَّ صَلَّى فَصَلَّى رَسُولُ اللَّه ﷺ ثُمَّ قَالَ: «بِهَذَا أُمِرْتُ». [رواه البخاري: ٥٢١]

**325.** Rəvayət edilir ki, bir gün Muğira ibn Şobə ﷺ İraqda ikən (əsr) namazını (başlanğıc vaxtından bir qədər) gec qıldı. (Bunu görən Əbu Məsud əl-Ənsari onun yanına gəlib) dedi: "Bu nədir, ey Muğira? Məgər sən bilmirsən ki, Cəbrail yerə enib namaz qıldı[1], Peyğəmbər ﷺ də o namazı qıldı; sonra yenə namaz qıldı, Peyğəmbər ﷺ də o namazı qıldı; sonra yenə namaz qıldı, Peyğəmbər ﷺ də o namazı qıldı; sonra yenə namaz qıldı, Peyğəmbər ﷺ də o namazı qıldı; sonra yenə namaz qıldı, Peyğəmbər ﷺ də o namazı qıldı[2] və dedi: "Mənə belə əmr edildi." (əl-Buxari, 521)

## 2-ci fəsil. Namaz kəffarədir[3]

## ٢ – باب: الصَّلاَةُ كَفَّارَةٌ

٣٢٦ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ كُنَّا جُلُوسًا عنْدَ عُمَرَ ﷺ، فَقَالَ أَيُّكُمْ يَحفَظُ قَوْلَ رَسُولِ اللَّه ﷺ فِى الْفتْنَة؟ قُلْتُ أَنَا، كَمَا قَالَهُ. قَالَ إِنَّكَ عَلَيْه – أَوْ عَلَيْهَا – لَجَرِيءٌ. قُلْتُ: «فتْنَةُ الرَّجُلِ فِى أَهْله وَمَاله وَوَلَده وَجَاره تُكَفِّرُهَا الصَّلاَةُ وَالصَّوْمُ وَالصَّدَقَةُ وَالأَمْرُ وَالنَّهْىُ. قَالَ لَيْسَ هَذَا أُرِيدُ، وَلَكنِ الْفتْنَةُ الَّتى تَمُوجُ كَمَا يَمُوجُ الْبَحْرُ. قَالَ لَيْسَ عَلَيْكَ منْهَا بَأْسٌ يَا أَميرَ الْمُؤْمنينَ، إِنَّ بَيْنَكَ وَبَيْنَهَا بَابًا مُغْلَقًا، قَالَ: أَيُكْسَرُ أَمْ يُفْتَحُ قَالَ: يُكْسَرُ، قَالَ: إِذًا لاَ يُغْلَقَ أَبَدًا، قيلَ لحُذَيْفَةَ: أَكَانَ عُمَرُ يَعْلَمُ الْبَابَ؟ قَالَ: نَعَمْ، كَمَا أَنَّ دُونَ الْغَد اللَّيْلَةَ، إِنِّى حَدَّثْتُهُ بِحَديثٍ لَيْسَ بِالأَغَاليط. فَسُئلَ: مَنِ البَابُ؟ فَقَالَ: عُمَرُ. [رواه البخاري: ٥٢٥]

**326.** Huzeyfə ﷺ rəvayət edir ki, (bir dəfə) biz Ömərin yanında ikən o soruşdu: "Peyğəmbərin ﷺ fitnə barədə dediyi sözlər hansınızın yadındadır?" Mən dedim: "Mənim (yadımdadır), həm də o dediyi kimi." Ömər dedi: "Həqiqətən də, sən bu işdə çox cəsarətlisən." Mən dedim: "İnsanın arvadı, mal-dövləti, övladı və qonşusu üzündən düşdüyü fitnəni namaz, oruc, sədəqə, (habelə insanlara yaxşı işlər görməyi) əmr etmək və (onları pis işlərdən) çəkindirmək (kimi ibadətlər) silib aparır." Ömər dedi: "Mən bunu deyil, elə bir fitnəni qəsd edirəm ki, o, təlatümə gəlmiş dəniz kimi (araya) çaxnaşma salacaqdır."

[1] Merac gecəsi Peyğəmbərə ﷺ beş vaxt namaz qılmaq vacib buyrulduqdan sonra o geriyə dönmüş, ertəsi gün də Cəbrail ﷺ yerə enib ona namaz vaxtlarını öyrətmişdir.
[2] Burada zöhr, əsr, məğrib, işa və fəcr namazları qəsd edilir.
[3] Burada yalnız kiçik günahların yuyulmasi nəzərdə tutulur.

Huzeyfə ﷺ dedi: "Ey möminlərin əmiri! O fitnənin sənə heç bir zərəri yoxdur. Çünki səninlə onun arasında bağlı bir qapı vardır." Ömər soruşdu: "(O qapı) sındırılacaq, yoxsa açılacaq?" Huzeyfə: "Sındırılacaq"– deyə cavab verdi. Ömər dedi: "Deməli, (bundan sonra) o heç vaxt bağlanmayacaqdır."

(Huzeyfədən ﷺ) soruşdular: "Ömər bu qapının (kim olduğunu) bilirdimi?" O dedi: "Bəli, (o, bu həqiqəti) gecədən sonra səhərin açılacağını bildiyi kimi (bilirdi). Mən ona (içində) yalan olmayan bir hədis danışdım."

Yenə soruşdular: "Bu qapı kim idi?" O dedi: "Bu qapı Ömər (özü idi)." (əl-Buxari, 525)

٣٢٧ – عَنْ ابْنِ مَسْعُودٍ الأَنْصَارِيِّ ﷺ، أَنَّ رَجُلاً أَصَابَ مِنَ امْرَأَةٍ قُبْلَةً، فَأَتَى النَّبِيَّ ﷺ فَأَخْبَرَهُ، فَأَنْزَلَ اللَّهُ ﴿ وَأَقِمِ ٱلصَّلَوٰةَ طَرَفَيِ ٱلنَّهَارِ وَزُلَفًا مِّنَ ٱلَّيْلِ ۚ إِنَّ ٱلْحَسَنَٰتِ يُذْهِبْنَ ٱلسَّيِّـَٔاتِ ﴾ فَقَالَ الرَّجُلُ يَا رَسُولَ اللَّهِ أَلِي هَذَا قَالَ: «لِجَمِيعِ أُمَّتِي كُلِّهِمْ». [رواه البخاري: ٥٢٧]

**327.** İbn Məsud ﷺ rəvayət edir ki, bir kişi Peyğəmbərin ﷺ yanına gəlib, (naməhrəm) bir qadını öpdüyünü ona xəbər verdi (və bunun nə dərəcədə günah olduğunu öyrənmək istədi). Uca Allah da bu ayəni nazil etdi: "Gündüzün iki başında (əvvəlində və axırında) və gecənin bəzi saatlarında namaz qıl! Həqiqətən, yaxşı işlər pis əməlləri silib aparır."[1] Kişi soruşdu: "Ey Allahın elçisi! Bu (hökm) yalnız mənə aiddir?" Peyğəmbər ﷺ dedi: "Bu, mənim ümmətimin hamısına aiddir!" (əl-Buxari, 526)

٣٢٨ – عَنْهُ ﷺ فِي رِوَايَةٍ: «لِمَنْ عَمِلَ بِهَا مِنْ أُمَّتِي». [رواه البخاري: ٤٦٨٧]

**328.** İbn Məsudun ﷺ digər rəvayətində deyilir ki, (Peyğəmbər ﷺ buyurdu): "Ümmətimdən bu ayəyə əməl edəcək kimsələr üçündür." (əl-Buxari, 4687)

## 3-cü fəsil. Namazın vaxtında qılınmasının fəziləti

## ٣– باب: فَضْلُ الصَّلاَةِ لِوَقْتِهَا

٣٢٩ – عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: سَأَلْتُ النَّبِيَّ ﷺ أَيُّ الْعَمَلِ أَحَبُّ إِلَى اللَّهِ؟ قَالَ: «الصَّلاَةُ عَلَى وَقْتِهَا». قَالَ ثُمَّ أَيٌّ؟ قَالَ: «ثُمَّ بِرُّ الْوَالِدَيْنِ». قَالَ ثُمَّ أَيٌّ؟ قَالَ: «الْجِهَادُ فِي سَبِيلِ اللَّهِ». قَالَ: حَدَّثَنِي بِهِنَّ رَسُولُ اللهِ ﷺ، وَلَوِ اسْتَزَدْتُهُ لَزَادَنِي. [رواه البخاري: ٥٢٧]

**329.** Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, mən Peyğəmbərdən ﷺ soruşdum: "Allahın ən çox sevdiyi (əməl) hansı əməldir?" O buyurdu: "Namazı vaxtlı-vaxtında qılmaq." Mən dedim: "Sonra hansıdır?" O buyurdu: "Valideynlərin qayğısına qalmaq." Mən dedim: "Bəs sonra hansıdır?" O buyurdu: "Allah yolunda cihad etmək."

Abdullah ibn Məsud ﷺ demişdir: "Bunları mənə Peyğəmbər ﷺ dedi. Əgər soruşsaydım, yenə cavab verərdi." (əl-Buxari, 527)

---

[1] "Hud" surəsi, 114.

## 4-cü fəsil. Beş vaxt qılınan namaz (bu vaxtlar arasında işlənən günahlar üçün) kəffarədir

## ٤ – باب: الصَّلَوَاتُ الْخَمْسُ كَفَّارَةٌ

٣٣٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «أَرَأَيْتُمْ لَوْ أَنَّ نَهَرًا بِبَابِ أَحَدِكُمْ، يَغْتَسِلُ فِيهِ كُلَّ يَوْمٍ خَمْسًا، مَا تَقُولُ ذَلِكَ يُبْقِي مِنْ دَرَنِهِ؟» قَالُوا: لاَ يُبْقِي مِنْ دَرَنِهِ شَيْئًا، قَالَ: «فَذَلِكَ مِثْلُ الصَّلَوَاتِ الْخَمْسِ، يَمْحُو اللَّهُ بِهَا الْخَطَايَا». [رواه البخاري: ٥٢٨]

**330.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir deyin görüm, əgər sizdən birinizin qapısının önündən çay axsaydı, o da hər gün bu çayda beş dəfə yuyunsaydı, onun (bədənində olan) çirkabdan bir şey qalardımı?" Əshabələr: "Onun (bədənindəki) çirkabdan heç nə qalmazdı"– deyə cavab verdikdə Peyğəmbər ﷺ buyurdu: "Beş vaxt qılınan namazların məsəli də buna bənzəyir. Belə ki, Allah bununla günahları silir!" (əl-Buxari, 528)

## 5-ci fəsil. Namaz qılan kimsə öz Rəbbi ﷻ ilə gizli söhbət edir

## ٥ – باب: الْمُصَلِّي يُنَاجِي رَبَّهُ عَزَّ وَجَلَّ

٣٣١ – عَنْ أَنَسٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ، «اعْتَدِلُوا فِي السُّجُودِ، وَلاَ يَبْسُطْ ذِرَاعَيْهِ كَالْكَلْبِ، وَإِذَا بَزَقَ فَلاَ يَبْزُقَنَّ بَيْنَ يَدَيْهِ وَلاَ عَنْ يَمِينِهِ، فَإِنَّهُ يُنَاجِي رَبَّهُ». [رواه البخاري: ٥٣٢]

**331.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Səcdələrinizi doğru-düzgün yerinə yetirin. Qoy (namaz qılan adam) it kimi dirsəklərini yerə qoymasın və tüpürmək istədikdə nə qabağına, nə də sağ tərəfinə tüpürməsin, çünki (namaz vaxtı) o, öz Rəbbi ilə gizli söhbətə girir." (əl-Buxari, 532)

## 6-cı fəsil. Bərk istilər düşdükdə zöhr namazının qılınmasını hava sərinləyənədək təxirə salmaq

## ٦ – باب: الإِبْرَادُ بِالظُّهْرِ فِي شِدَّةِ الْحَرِّ

٣٣٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا اشْتَدَّ الْحَرُّ فَأَبْرِدُوا بِالصَّلاَةِ، فَإِنَّ شِدَّةَ الْحَرِّ مِنْ فَيْحِ جَهَنَّمَ، وَاشْتَكَتِ النَّارُ إِلَى رَبِّهَا، فَقَالَتْ: يَا رَبِّ أَكَلَ بَعْضِي بَعْضًا، فَأَذِنَ لَهَا بِنَفَسَيْنِ نَفَسٍ فِي الشِّتَاءِ، وَنَفَسٍ فِي الصَّيْفِ، فَهُوَ أَشَدُّ مَا تَجِدُونَ مِنَ الْحَرِّ، وَأَشَدُّ مَا تَجِدُونَ مِنَ الزَّمْهَرِيرِ». [رواه البخاري: ٥٣٧]

**332.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Hava) bərk istiləşdikdə sərin düşənədək namazı təxirə salın, çünki istilərin artması Cəhənnəmin nəfəs almasına görədir – (bir zaman) Cəhənnəm öz Rəbbinə şikayət edib demişdir: "Ey Rəbbim, bir hissəm digər hissəmi yedi!" Rəbbi də ona iki dəfə nəfəs almağa izn verdi: bir dəfə qışda, bir dəfə də yayda. Bu, sizin *il boyu* gördüyünüz ən şiddətli isti və ən şiddətli soyuqdur." (əl-Buxari, 537)

٣٣٣ – عَنْ أَبِى ذَرٍّ الغفَاريِّ ﷺ قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ فِي سَفَر، فَأَرَادَ المُؤَذِّنُ أَنْ يُؤَذِّنَ للظُّهْرِ، فَقَالَ النَّبِيُّ ﷺ: «أَبْرِدْ» ثُمَّ أَرَادَ أَنْ يُؤَذِّنَ، فَقَالَ لَهُ: «أَبْرِدْ» حَتَّى رَأَيْنَا فَيْءَ التُّلُولِ. [رواه البخاري: ٥٣٥]

**333.** Əbu Zərr əl-Ğifari ﷺ rəvayət edir ki, (bir dəfə) biz Peyğəmbərlə ﷺ birlikdə səfərdə ikən müəzzin zöhr namazı üçün azan vermək istədi. Peyğəmbər ﷺ (ona): "Sərin düşənədək (gözlə)"– dedi. (Bir müddət) sonra müəzzin (yenidən) azan oxumaq istədikdə Peyğəmbər ﷺ (yenə): "Sərin düşənədək (gözlə)"– dedi. Biz təpələrin kölgələrinin uzandığını görənə qədər (gözlədik). (əl-Buxari, 535)

## 7-ci fəsil. Zöhr namazının vaxtı gün batmağa meyl etdiyi zaman başlayır

## ٧– باب: وَقْتُ الظُّهْرِ عِنْدَ الزَّوَالِ

٣٣٤ – عَنْ أَنَسُ بْنُ مَالك ﷺ، أَنَّ رَسُولَ اللَّه ﷺ خَرَجَ حينَ زَاغَت الشَّمْسُ فَصَلَّى الظُّهْرَ، فَقَامَ عَلَى الْمنْبَر، فَذَكَرَ السَّاعَةَ، فَذَكَرَ أَنَّ فيهَا أُمُورًا عظَامًا، ثُمَّ قَالَ: «مَنْ أَحَبَّ أَنْ يَسْأَلَ عَنْ شَيْءٍ فَلْيَسْأَلْ، فَلاَ تَسْأَلُونى عَنْ شَيْءٍ إِلاَّ أَخْبَرْتُكُمْ مَا دُمْتُ فِى مَقَامِى هَذَا». فَأَكْثَرَ النَّاسُ فِى الْبُكَاء، وَأَكْثَرَ أَنْ يَقُولَ: «سَلُونِى» فَقَامَ عَبْدُ اللَّه بْنُ حُذَافَةَ السَّهْمِىُّ فَقَالَ: مَنْ أَبِى قَالَ: «أَبُوكَ حُذَافَةُ». ثُمَّ أَكْثَرَ أَنْ يَقُولَ: «سَلُونِى». فَبَرَكَ عُمَرُ عَلَى رُكْبَتَيْه فَقَالَ: رَضِينَا باللَّه رَبًّا، وَبالإِسْلاَمِ دينًا، وَبِمُحَمَّد نَبِيًّا. فَسَكَتَ، ثُمَّ قَالَ: «عُرِضَتْ عَلَيَّ الْجَنَّةُ وَالنَّارُ آنفًا فِى عُرْضِ هَذَا الْحَائِطِ فَلَمْ أَرَ كَالْخَيْرِ وَالشَّرِّ» [رواه البخاري: ٥٤٠]

**334.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, (bir dəfə) gün batmağa meyl edərkən Peyğəmbər ﷺ (evdən) çıxdı və zöhr namazını qıldı. (Bundan sonra) o, minbərin üstünə qalxıb Qiyamət saatını yada saldı və həmin gün baş verəcək dəhşətli hadisələri xatırlatdı. Sonra dedi: "Kim (məndən) bir şey soruşmaq istəyirsə, qoy soruşsun. Bu yerdə dayandığım müddətədək məndən hər nə soruşsanız, sizə xəbər verəcəyəm." (Bunu deyəndə) camaat hönkür-hönkür ağlamağa başladı. Peyğəmbər ﷺ isə: "Məndən soruşun!"– deyə təkrar edirdi. Bu vaxt Abdullah ibn Hüzafə əs-Səhmi ayağa qalxıb: "Mənim atam kimdir?"– deyə soruşdu. Peyğəmbər ﷺ: "Sənin atan Hüzafədir"– dedi, sonra (yenə): "Məndən soruşun"– deyə təkrar etməyə başladı. (O, bu sözləri o vaxta qədər təkrar etdi ki, axırda) Ömər diz çöküb dedi: "Biz Allahın Rəbb, İslamın din və Muhəmmədin peyğəmbər olduğundan razıyıq!" Bundan sonra Peyğəmbər ﷺ (bir qədər) susdu. Sonra dedi: "İndicə bu divarda mənə Cənnət və Cəhənnəm göstərildi. Mən belə bir xeyir və belə bir şər (Cənnət kimi heyrətamiz və Cəhənnəm kimi qorxunc bir şey) görməmişdim." (əl-Buxari, 540)

٣٣٥ – عَنْ أَبِى بَرْزَةَ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ يُصَلِّى الصُّبْحَ وَأَحَدُنَا يَعْرِفُ جَلِيسَهُ، وَيَقْرَأُ فِيهَا مَا بَيْنَ السِّتِّينَ إِلَى الْمِائَة، وَيُصَلِّى الظُّهْرَ إِذَا زَالَت الشَّمْسُ، وَالْعَصْرَ وَأَحَدُنَا يَذْهَبُ إِلَى أَقْصَى الْمَدِينَة ثُمَّ يَرْجِعُ وَالشَّمْسُ حَيَّةٌ، وَنَسِيتُ مَا قَالَ فِى الْمَغْرِب، وَلاَ يُبَالِى بِتَأْخِيرِ الْعِشَاءِ إِلَى ثُلُثِ اللَّيْلِ. ثُمَّ قَالَ: إِلَى شَطْرِ اللَّيْلِ. [رواه البخاري: ٥٤١]

**335.** Əbu Bərzə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ sübh namazını bitirdikdən sonra hər birimiz yanında oturanın üzünü seçə bilirdi; o (bu namazda) altmışdan yüzə qədər ayə oxuyardı; zöhr namazını isə gün batmağa meyl etdiyi vaxt qılardı; əsr namazını (qıldırdıqdan sonra), birimiz Mədinənin lap kənarına gedibqayıdar, qünəş isə hələ də (adamı) yandırırdı.

(Əbu Minhəl ﷺ) demişdir: “Mən (Əbu Bərzənin ﷺ) məğrib namazı haqqında dediyini unutdum.”

(Əbu Bərzə ﷺ) demişdir: “Peyğəmbər ﷺ işa namazını gecənin (ilk) üçdə birinə qədər, hətta gecənin yarısınadək yubatmağın fərqinə varmazdı.” (əl-Buxari, 541)

## 8-ci fəsil. Zöhr namazını əsr namazınadək təxirə salmaq

## ٨– باب: تَأْخِيرُ الظُّهْرِ إِلَى الْعَصْرِ

٣٣٦ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما: أَنَّ النَّبِيَّ ﷺ صَلَّى بِالْمَدِينَةِ سَبْعًا وَثَمَانِيًا الظُّهْرَ وَالْعَصْرَ، وَالْمَغْرِبَ وَالْعِشَاءَ. [رواه البخاري: ٥٤٣]

**336.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Mədinədə zöhrlə əsri, məğriblə işanı (birləşdirərək) yeddi rükət və səkkiz rükət namaz qıldı.[1] (əl-Buxari, 543)

## 9-cu fəsil. Əsr namazının vaxtı

## ٩– باب: وَقْتُ الْعَصْرِ

٣٣٧ – عَنْ سَيَّارِ بْنِ سَلاَمَةَ قَالَ دَخَلْتُ أَنَا وَأَبِي عَلَى أَبِي بَرْزَةَ الأَسْلَمِيِّ ﷺ، فَقَالَ لَهُ أَبِي: كَيْفَ كَانَ رَسُولُ اللَّهِ ﷺ يُصَلِّي الْمَكْتُوبَةَ فَقَالَ كَانَ يُصَلِّي الْهَجِيرَ الَّتِي تَدْعُونَهَا الأُولَى حِينَ تَدْحَضُ الشَّمْسُ، وَيُصَلِّي الْعَصْرَ، ثُمَّ يَرْجِعُ أَحَدُنَا إِلَى رَحْلِهِ فِي أَقْصَى الْمَدِينَةِ وَالشَّمْسُ حَيَّةٌ – وَنَسِيتُ مَا قَالَ فِي الْمَغْرِبِ – وَكَانَ يَسْتَحِبُّ أَنْ يُؤَخِّرَ الْعِشَاءَ الَّتِي تَدْعُونَهَا الْعَتَمَةَ، وَكَانَ يَكْرَهُ النَّوْمَ قَبْلَهَا وَالْحَدِيثَ بَعْدَهَا، وَكَانَ يَنْفَتِلُ مِنْ صَلاَةِ الْغَدَاةِ حِينَ يَعْرِفُ الرَّجُلُ جَلِيسَهُ، وَيَقْرَأُ بِالسِّتِّينَ إِلَى الْمِائَةِ». [رواه البخاري: ٥٤٧]

**337.** Səyyar ibn Sələmə ﷺ demişdir: “Mən atamla barəbər Əbu Bərzə əl-Əsləminin ﷺ yanına daxil oldum və atam ondan: “Peyğəmbər ﷺ vacib buyrulmuş namazları necə qılardı?”– deyə soruşdu. O dedi: “Sizin ulə[2] adlandırdığınız zöhr namazını günəş batmağa meyl etdiyi vaxt qılardı. Əsr namazını qıldırdıqdan sonra birimiz Mədinənin lap kənarında olan evinə qayıdar, qünəş isə hələ də (adamı) yandırardı. (Ravi deyir ki,) mən (Əbu Bərzənin) məğrib namazı haqqında dediyini unutmuşam. (Əbu Bərzə rəvayətinə davam edib dedi): ”Peyğəmbər ﷺ sizin ətəmə[3] adlandırdığınız işa namazını (gecənin yarısınadək) yubatmağı sevər, bu namazdan əvvəl yatmağı və ondan sonra danışmağı xoşlamazdı. Sübh namazını isə hər kəs yanında oturanın üzünü aydın seçə bildiyi bir vaxtda bitirər və (bu namazda) altmışdan yüzə qədər ayə oxuyardı.” (əl-Buxari, 547)

---

[1] Bir çox məşhur alimlər bu hədisi izah edərkən demişlər ki, zəruri halda namazları birləşdirmək caizdir, lakin bu, adət halını almamalıdır. Çünki Peyğəmbər ﷺ daim hər bir namazı öz vaxtında qılmışdır. Peyğəmbərin ﷺ leysan yağışlar yağdıqda, təhlükə olduqda, səfərdə və başqa bu kimi müstəsna hallarda namazları birləşdirməsi, onun ümmətinə çətinlik yaratmaq istəmədiyinə dəlalət edir. İmam Muslimin bu xüsusda rəvayət etdiyi hədisdə Səid ibn Cubeyr ibn Abbasdan: “Nə üçün Peyğəmbər ﷺ belə etmişdir?”- deyə soruşduqda ibn Abbas demişdir: “O, ümmətindən heç kəsi çətinliyə salmaq istəmədiyi üçün belə etmişdir.”

[2] “Ulə” – birinci deməkdir. Merac gecəsində Peyğəmbərimizə ﷺ gündəlik beş vaxt namaz qılmaq vacib buyrulduqdan sonra onun Cəbrail ﷺ ilə birlikdə qıldığı ilk namaz zöhr namazı olmuşdur. Elə bu səbəbdən də əshabələr bu namazı “ulə” adlandırırdılar.

[3] “Ətəmə” – gecənin birinci üçdə bir hissəsi.

٣٣٨ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: كُنَّا نُصَلِّى الْعَصْرَ ثُمَّ يَخْرُجُ الإِنْسَانُ إِلَى بَنِى عَمْرِو بْنِ عَوْفٍ فَيَجِدُهُمْ يُصَلُّونَ الْعَصْرَ. [رواه البخاري: ٥٤٨]

**338.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, biz əsr namazını qıldıqdan sonra adam Amr ibn Əuf qəbiləsinə gedib onların həmin namazı qıldığını görə bilərdi. (əl-Buxari, 548)

٣٣٩ – عَنْهُ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُصَلِّى الْعَصْرَ وَالشَّمْسُ مُرْتَفِعَةٌ حَيَّةٌ، فَيَذْهَبُ الذَّاهِبُ إِلَى الْعَوَالِى فَيَأْتِيهِمْ وَالشَّمْسُ مُرْتَفِعَةٌ، وَبَعْضُ الْعَوَالِى مِنَ الْمَدِينَةِ عَلَى أَرْبَعَةِ أَمْيَالٍ أَوْ نَحْوِهِ. [رواه البخاري: ٥٥٠]

**339.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ günəş yüksəklikdə olduğu və (adamı) yandırdığı vaxtda əsr namazını qılardı. (Namazdan sonra) Əvaliyə[1] getmək istəyən kəs (oraya) gedər və günəş hələ yüksəklikdə olduğu vaxtda onların yanına qayıdardı. Hərçənd ki, Əvalinin bəzi yerləri Mədinənin dörd milliyində və ya buna yaxın məsafədə yerləşirdi. (əl-Buxari, 550)

## 10-cu fəsil. Əsr namazını buraxanların günahı

## ١٠ – باب: إِثْمُ مَنْ فَاتَتْهُ الْعَصْرُ

٣٤٠ – عَنْ ابْنِ عُمَرَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «الَّذِى تَفُوتُهُ صَلاَةُ الْعَصْرِ كَأَنَّمَا وُتِرَ أَهْلَهُ وَمَالَهُ». [رواه البخاري: ٥٥٢]

**340.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əsr namazını buraxan adam ailəsini və malını itirmiş kimidir." (əl-Buxari, 552)

## 11-ci fəsil. Əsr namazını qılmayan kimsələr

## ١١ – باب: مَنْ تَرَكَ الْعَصْرَ

٣٤١ – عَنْ بُرَيْدَةَ ﷺ أَنَّهُ قَالَ فِى يَوْمٍ ذِى غَيْمٍ: بَكِّرُوا بِصَلاَةِ الْعَصْرِ فَإِنَّ النَّبِىَّ ﷺ قَالَ: «مَنْ تَرَكَ صَلاَةَ الْعَصْرِ فَقَدْ حَبِطَ عَمَلُهُ». [رواه البخاري: ٥٥٣]

**341.** Rəvayət edilir ki, hava buludlu olduğu bir gündə Bureydə ﷺ demişdir: "Əsr namazını erkən[2] qılın. Çünki Peyğəmbər ﷺ demişdir: "Əsr namazını (qəsdən) qılmayan kimsənin əməli puç olar." (əl-Buxari, 553)

## 12-ci fəsil. Əsr namazının fəziləti

## ١٢ – باب: فَضْلُ صَلاَةِ العَصْرِ

٣٤٢ – عَنْ جَرِيرٍ ﷺ قَالَ: كُنَّا عِنْدَ النَّبِىِّ ﷺ فَنَظَرَ إِلَى الْقَمَرِ لَيْلَةً فَقَالَ: «إِنَّكُمْ سَتَرَوْنَ رَبَّكُمْ كَمَا تَرَوْنَ هَذَا الْقَمَرَ لاَ تُضَامُونَ فِى رُؤْيَتِهِ، فَإِنِ اسْتَطَعْتُمْ أَنْ لاَ تُغْلَبُوا عَلَى صَلاَةٍ قَبْلَ طُلُوعِ الشَّمْسِ وَقَبْلَ غُرُوبِهَا فَافْعَلُوا». ثُمَّ قَرَأَ: ﴿وَسَبِّحْ بِحَمْدِ رَبِّكَ قَبْلَ طُلُوعِ ٱلشَّمْسِ وَقَبْلَ ٱلْغُرُوبِ﴾. [رواه البخاري: ٥٥٤]

[1] Əvali – Mədinənin ətrafında olan yaşayış yerləri.
[2] Burada erkən deyildikdə namazı ilk vaxtında qılmaq nəzərdə tutulur.

**342.** Cərir ﷺ rəvayət edir ki, (bədr)[1] gecəsi biz Peyğəmbərin ﷺ yanında ikən o, aya baxıb dedi: "Siz bu ayı gördüyünüz kimi, Rəbbinizi də (öz gözünüzlə) görəcək və Ona baxmaq üçün bir-birinizə mane olmayacaqsınız. Əgər gün doğmamışdan və batmamışdan əvvəl sizi namaz[2] qılmaqdan yayındıracaq (işlərdən) çəkinə bilirsinizsə, çəkinin." Sonra o (bu ayəni) oxudu: **"Gün doğmamışdan əvvəl və batmamışdan əvvəl Rəbbini həmd ilə təriflə!"**[3] (əl-Buxari, 554)

٣٤٣ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «يَتَعَاقَبُونَ فِيكُمْ مَلاَئِكَةٌ بِاللَّيْلِ وَمَلاَئِكَةٌ بِالنَّهَارِ، وَيَجْتَمِعُونَ فِى صَلاَةِ الْفَجْرِ وَصَلاَةِ الْعَصْرِ، ثُمَّ يَعْرُجُ الَّذِينَ بَاتُوا فِيكُمْ، فَيَسْأَلُهُمْ وَهْوَ أَعْلَمُ بِهِمْ كَيْفَ تَرَكْتُمْ عِبَادِى فَيَقُولُونَ تَرَكْنَاهُمْ وَهُمْ يُصَلُّونَ، وَأَتَيْنَاهُمْ وَهُمْ يُصَلُّونَ». [رواه البخاري: ٥٥٥]

**343.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir dəstə mələk gecələr, bir dəstə mələk də gündüzlər növbə ilə sizin yanınıza gəlir, onlar sübh və əsr namazlarında bir yerə toplanırlar. Bundan sonra gecəni[4] sizin aranızda keçirən mələklər (səmaya) qalxır və Allah onlardan: "Siz Mənim qullarımı nə vəziyyətdə tərk etmisiniz?"– deyə soruşur, halbuki O, qullarının (nə etdiklərini) daha yaxşı bilir. Bununla belə onlar deyirlər: "Biz onları namaz qıldıqları halda tərk etdik, yanlarına gəldikdə də onlar namaz qılırdılar." (əl-Buxari, 555)

## 13-cü fəsil. Gün batmamışdan əvvəl əsr namazının bir rükətinə yetişən kimsə

## ١٣– باب: مَنْ أَدْرَكَ رَكْعَةً مِنَ الْعَصْرِ قَبْلَ الْغُرُوبِ

٣٤٤ – عَنْهُ ﷺ قَالَ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِذَا أَدْرَكَ أَحَدُكُمْ سَجْدَةً مِنْ صَلاَةِ الْعَصْرِ قَبْلَ أَنْ تَغْرُبَ الشَّمْسُ فَلْيُتِمَّ صَلاَتَهُ، وَإِذَا أَدْرَكَ سَجْدَةً مِنْ صَلاَةِ الصُّبْحِ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ فَلْيُتِمَّ صَلاَتَهُ». [رواه البخاري: ٥٥٦]

**344.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz gün batmamışdan əvvəl əsr namazının bir rükətini qılmağa müvəffəq olarsa, qoy namazını tamamlasın, (həmçinin) gün doğmamışdan əvvəl sübh namazının bir rükətini qılmağa müvəffəq olarsa, qoy namazını tamamlasın." (əl-Buxari, 556)

٣٤٥ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رَضِيَ اللهُ عَنْهُمَا، أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِنَّمَا بَقَاؤُكُمْ فِيمَا سَلَفَ قَبْلَكُمْ مِنَ الأُمَمِ كَمَا بَيْنَ صَلاَةِ الْعَصْرِ إِلَى غُرُوبِ الشَّمْسِ، أُوتِىَ أَهْلُ التَّوْرَاةِ التَّوْرَاةَ فَعَمِلُوا حَتَّى إِذَا انْتَصَفَ النَّهَارُ

---

[1] Bu gecənin məhz bədr gecəsi olduğu Muslimin Səhih əsərində rəvayət edilmişdir. Burada bədr deyildikdə qəməri aylarda ayın on dördüncü gecəsi qəsd edilir. Elə buna görə də on dörd gecəlik, yəni tam dairə şəklinə düşmüş aya bədrlənmiş ay deyilir.

[2] Burada sübh və əsr namazları nəzərdə tutulur.

[3] "Qaf" surəsi, 39.

[4] Hədisdə: "gecəni sizin aranızda keçirən mələklər"- deyildikdə təkcə onlar deyil, habelə gündüzlər möminlərin arasında olub növbəsi yetişdikdən sonra səmaya qalxan mələklər də nəzərdə tutulur. Bu izah ibn Xuzeymənin "Səhih" əsərində mötəbər isnadla rəvayət edilən hədisdə öz təsdiqini tapmışdır. Bu hədisdə Peyğəmbər ﷺ demişdir: "...onlar sübh namazında bir yerə toplandıqdan sonra gecəni sizin aranızda keçirən mələklər səmaya qalxır, qalanları isə sizin aranızda qalırlar, habelə əsr namazında bir yerə toplandıqdan sonra gündüzü sizin aranızda keçirən mələklər səmaya qalxır, qalanları isə sizin aranızda qalırlar..." (Fəthul-Bari, 2/330).

عَجَزُوا، فَأُعْطُوا قِيرَاطًا قِيرَاطًا، ثُمَّ أُوتِىَ أَهْلُ الإِنْجِيلِ الإِنْجِيلَ فَعَمِلُوا إِلَى صَلاَةِ الْعَصْرِ، ثُمَّ عَجَزُوا، فَأُعْطُوا قِيرَاطًا قِيرَاطًا، ثُمَّ أُوتِينَا الْقُرْآنَ فَعَمِلْنَا إِلَى غُرُوبِ الشَّمْسِ، فَأُعْطِينَا قِيرَاطَيْنِ قِيرَاطَيْنِ، فَقَالَ أَهْلُ الْكِتَابَيْنِ أَىْ رَبَّنَا أَعْطَيْتَ هَؤُلاَءِ قِيرَاطَيْنِ قِيرَاطَيْنِ، وَأَعْطَيْتَنَا قِيرَاطًا قِيرَاطًا، وَنَحْنُ كُنَّا أَكْثَرَ عَمَلاً، قَالَ قَالَ اللَّهُ عَزَّ وَجَلَّ هَلْ ظَلَمْتُكُمْ مِنْ أَجْرِكُمْ مِنْ شَىْءٍ قَالُوا لاَ، قَالَ فَهُوَ فَضْلِى أُوتِيهِ مَنْ أَشَاءُ». [رواه البخاري: ٥٥٧]

**345.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Sizdən öncə gəlib-getmiş ümmətlərin (dünyada qaldığı müddətlə) müqayisədə sizin qaldığınız müddət əsr namazından gün batana qədər olan vaxt kimidir. Tövrat əhlinə Tövrat verilmişdi və onlar (Allahın hökmlərinə) riayət edirdilər. Nəhayət, günortaya yetişdikdə yorulub əldən düşdülər və buna görə də onlara bir karat[1] (mükafat) verildi. İncil əhlinə də İncil verilmişdi; onlar əsr namazınadək (Allahın hökmlərinə) riayət etdilər və axırda yorulub əldən düşdülər, buna görə də onlara bir karat (mükafat) verildi. Daha sonra bizə Quran verildi və biz gün batanadək (Allahın hökmlərinə) riayət etdik, buna görə də bizə iki karat (mükafat) verildi. Belə olduqda hər iki Kitab əhli deyəcək: "Ey Rəbbimiz! Sən onlara iki karat, bizə isə bir karat verdin. Halbuki biz onlardan daha çox əməl etmişik." Qüdrətli və Böyük Allah buyuracaq: "Məgər Mən sizə mükafat verdikdə sizə qarşı haqsızlıq etmişəm?" Onlar: "Xeyr!"– deyə cavab verəcəklər. Onda Allah buyuracaq: "Bu, Mənim lütfümdür, onu istədiyimə verirəm." (əl-Buxari, 557)

## 14-cü fəsil. Məğrib namazının vaxtı

## ١٤– باب: وَقْتُ الْمَغْرِبِ

**٣٤٦** – عَنْ رَافِعِ بْنَ خَدِيجٍ قَالَ: كُنَّا نُصَلِّى الْمَغْرِبَ مَعَ النَّبِىِّ ﷺ فَيَنْصَرِفُ أَحَدُنَا وَإِنَّهُ لَيُبْصِرُ مَوَاقِعَ نَبْلِهِ. [رواه البخاري: ٥٥٩]

**346.** Rafi ibn Xədic ﷺ rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birlikdə məğrib namazını qıldıqdan sonra (hər) birimiz namazdan çıxar və atdığı oxun düşdüyü yeri görə bilərdi. (əl-Buxari, 559)

**٣٤٧** – عَنْ جَابِرِ بْنَ عَبْدِ اللَّهِ قَالَ: كَانَ النَّبِىُّ ﷺ يُصَلِّى الظُّهْرَ بِالْهَاجِرَةِ، وَالْعَصْرَ وَالشَّمْسُ نَقِيَّةٌ، وَالْمَغْرِبَ إِذَا وَجَبَتْ، وَالْعِشَاءَ أَحْيَانًا وَأَحْيَانًا، إِذَا رَآهُمُ اجْتَمَعُوا عَجَّلَ، وَإِذَا رَآهُمْ أَبْطَوْا أَخَّرَ ، وَالصُّبْحَ كَانُوا، أَوْ كَانَ النَّبِىُّ ﷺ يُصَلِّيهَا بِغَلَسٍ. [رواه البخاري: ٥٦٠]

**347.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ zöhr namazını günorta vaxtı, əsr namazını günəş hələ parlaq ikən, məğrib namazını günəş batdıqda, işa namazını isə hərdən (ilk vaxtında), hərdən də (axır vaxtında) qılardı. Görsəydi ki camaat (məscidə) toplaşıb, (namazı) erkən qılardı, görəndə ki onlar yubanırlar, (onu) gec qılardı. Sübh namazını isə onlar (yaxud Peyğəmbər ﷺ) ala-qaranlıqda qılardı. (əl-Buxari, 560)

---

[1] Burada karat deyildikdə Qiyamət günü əməlisaleh mömin insanların payına düşən mükafat nəzərdə tutulur. Əslində, bir karat daniqin yarısına, daniq isə dirhəmin altıda birinə bərabərdir.

## 15-ci fəsil. Məğrib namazını işa namazı adlandırmaq istəməyən kimsə

## ١٥- باب: مَنْ كَرِهَ أَنْ يُقَالَ لِلْمَغْرِبِ الْعِشَاءُ

٣٤٨ - عَنْ عَبْدِ اللهِ الْمُزَنِيِّ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «لاَ تَغْلِبَنَّكُمُ الأَعْرَابُ عَلَى اسْمِ صَلاَتِكُمُ الْمَغْرِبِ». قَالَ: وَتَقُولُ الأَعْرَابُ هِيَ الْعِشَاءُ. [رواه البخاري: ٥٦٣]

**348.** Abdullah (ibn Müğəffəl) əl-Muzəni ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qətiyyən bədəvilərin məğrib namazınızın adı ilə bağlı (adətinə) uymayın."

(Ravi) demişdir: "Bədəvilər (məğrib namazına): –Bu, işa namazıdır,– deyirlər". (əl-Buxari, 563)

## 16-cı fəsil. İşa namazının fəziləti

## ١٦- باب: فَضْلُ الْعِشَاءِ

٣٤٩ - عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: أَعْتَمَ رَسُولُ اللَّهِ ﷺ لَيْلَةً بِالْعِشَاءِ، وَذَلِكَ قَبْلَ أَنْ يَفْشُوَ الإِسْلاَمُ، فَلَمْ يَخْرُجْ حَتَّى قَالَ عُمَرُ نَامَ النِّسَاءُ وَالصِّبْيَانُ. فَخَرَجَ فَقَالَ لأَهْلِ الْمَسْجِدِ: «مَا يَنْتَظِرُهَا أَحَدٌ مِنْ أَهْلِ الأَرْضِ غَيْرُكُمْ». [رواه البخاري: ٥٦٦]

**349.** Aişə ﵂ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ İslam hələ (Mədinədən kənara) yayılmadığı bir dövrdə, işa namazını (gecənin ilk üçdə birinədək) gecikdirdi və Ömər: "Qadınlar və uşaqlar artıq yatıblar"– deməyincə, (evdən) çıxmadı. (Yalnız bundan) sonra bayıra çıxdı və məsciddəkilərə dedi: "Sizdən başqa yer üzündə yaşayanlardan heç bir kimsə (bu saatda) işa namazını gözləmir." (əl-Buxari, 566)

٣٥٠ - عَنْ أَبِي مُوسَى ﵁ قَالَ: كُنْتُ أَنَا وَأَصْحَابِي الَّذِينَ قَدِمُوا مَعِي فِي السَّفِينَةِ نُزُولاً فِي بَقِيعِ بُطْحَانَ، وَالنَّبِيُّ ﷺ بِالْمَدِينَةِ، فَكَانَ يَتَنَاوَبُ النَّبِيَّ ﷺ عِنْدَ صَلاَةِ الْعِشَاءِ كُلَّ لَيْلَةٍ نَفَرٌ مِنْهُمْ، فَوَافَقْنَا النَّبِيَّ ﷺ أَنَا وَأَصْحَابِي وَلَهُ بَعْضُ الشُّغْلِ فِي بَعْضِ أَمْرِهِ فَأَعْتَمَ بِالصَّلاَةِ حَتَّى ابْهَارَّ اللَّيْلُ، ثُمَّ خَرَجَ النَّبِيُّ ﷺ فَصَلَّى بِهِمْ، فَلَمَّا قَضَى صَلاَتَهُ قَالَ لِمَنْ حَضَرَهُ: «عَلَى رِسْلِكُمْ، أَبْشِرُوا إِنَّ مِنْ نِعْمَةِ اللَّهِ عَلَيْكُمْ أَنَّهُ لَيْسَ أَحَدٌ مِنَ النَّاسِ يُصَلِّي هَذِهِ السَّاعَةَ غَيْرُكُمْ». أَوْ قَالَ: «مَا صَلَّى هَذِهِ السَّاعَةَ أَحَدٌ غَيْرُكُمْ». لاَ يَدْرِي أَيَّ الْكَلِمَتَيْنِ قَالَ. قَالَ أَبُو مُوسَى ﵁ فَرَجَعْنَا فَفَرِحْنَا بِمَا سَمِعْنَا مِنْ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٥٦٧]

**350.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "Mən və mənimlə birlikdə (Yəməndən) gəmidə gəlmiş yoldaşlarım (bir müddət) Buthan vadisində qaldıq. O zaman Peyğəmbər ﷺ Mədinədə idi. Bizlərdən bəziləri hər gecə işa namazı vaxtı növbə ilə Peyğəmbərin ﷺ yanına gedərdi. (Bir gecə) mən yoldaşlarımla Peyğəmbərin ﷺ yanına gəldikdə o özünə aid olan bir işlə məşğul idi. Buna görə də namazı gecə yarısınadək gecikdirdi. Sonra (evindən) çıxıb camaata namaz qıldırdı. Namazını bitirdikdən sonra orada olanlara dedi: "Tələsməyin! Sevinin! Həqiqətən də, Allahın sizə olan lütfündəndir ki, sizdən başqa yer üzündə yaşayanlardan heç kəs (bu saatda) işa namazını qılmır (və ya sizdən başqa heç kəs bu vaxt namaz qılmır)."

(Rəvayətçi) onun bu sözlərdən hansı birini söylədiyini bilmirdi.

Əbu Musa dedi: "Biz Peyğəmbərdən ﷺ eşitdiyimizə sevindik və (yerimizə) qayıtdıq." (əl-Buxari, 567)

## ١٧– باب: النَّوْمُ قَبْلَ الْعِشَاءِ لِمَنْ غُلِبَ

## 17-ci fəsil. Gözlərindən yuxu tökülən kimsənin işa namazından qabaq yatması

٣٥١ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: أَعْتَمَ رَسُولُ اللَّهِ ﷺ بِالْعِشَاءِ حَتَّى نَادَاهُ عُمَرُ الصَّلاَةَ، نَامَ النِّسَاءُ وَالصِّبْيَانُ. فَخَرَجَ فَقَالَ: «مَا يَنْتَظِرُهَا أَحَدٌ مِنْ أَهْلِ الأَرْضِ غَيْرُكُمْ». قَالَتْ: وَلاَ يُصَلَّى يَوْمَئِذٍ إِلاَّ بِالْمَدِينَةِ، وَكَانُوا يُصَلُّونَ فِيمَا بَيْنَ أَنْ يَغِيبَ الشَّفَقُ إِلَى ثُلُثِ اللَّيْلِ الأَوَّلِ. [رواه البخاري: ٥٦٩]

**351.** Aişə رضي الله عنها rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ işa namazını (gecənin ilk üçdə birinədək) gecikdirdi və Ömər: "Qadınlar və uşaqlar artıq yatıblar"– deyə (onu) çağırdı. Bundan sonra Peyğəmbər ﷺ bayıra çıxıb dedi: "Sizdən başqa yer üzündə yaşayanlardan heç bir kimsə (bu saatda) işa namazını gözləmir."

O zamanlar Mədinədən başqa heç bir yerdə (açıq şəkildə) namaz qılınmırdı. Onlar bu namazı günəşin şəfəqi yox olduğu andan gecənin ilk üçdə birinə qədər olan vaxt ərzində qılardılar. (əl-Buxari, 569)

٣٥٢ – وَ فِي رِوَايَةٍ عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: فَخَرَجَ نَبِيُّ اللَّهِ ﷺ كَأَنِّي أَنْظُرُ إِلَيْهِ الآنَ، يَقْطُرُ رَأْسُهُ مَاءً، وَاضِعًا يَدَهُ عَلَى رَأْسِهِ فَقَالَ: «لَوْلاَ أَنْ أَشُقَّ عَلَى أُمَّتِي لأَمَرْتُهُمْ أَنْ يُصَلُّوهَا هَكَذَا».

وَ حَكَى ابْنُ عَبَّاسٍ رضي الله عنهما: كَيْفَ وَضَعَ النَّبِيُّ ﷺ عَلَى رَأْسِهِ يَدَهُ: فَبَدَّدَ بَيْنَ أَصَابِعِهِ شَيْئًا مِنْ تَبْدِيدٍ، ثُمَّ وَضَعَ أَطْرَافَ أَصَابِعِهِ عَلَى قَرْنِ الرَّأْسِ، ثُمَّ ضَمَّهَا يُمِرُّهَا كَذَلِكَ عَلَى الرَّأْسِ حَتَّى مَسَّتْ إِبْهَامُهُ طَرَفَ الأُذُنِ مِمَّا يَلِي الْوَجْهَ عَلَى الصُّدْغِ وَنَاحِيَةِ اللِّحْيَةِ، لاَ يُقَصِّرُ وَلاَ يَبْطُشُ إِلاَّ كَذَلِكَ. [رواه البخاري: ٥٧١]

**352.** İbn Abbasdan رضي الله عنهما gələn başqa bir rəvayətdə o demişdir: "Peyğəmbər ﷺ bayıra çıxdı – o, sanki indi də gözlərim önündədir, başından su damcılayırdı, əlini də başına qoymuşdu. O buyurdu: "Əgər ümmətimə çətin olmasaydı, bu namazı məhz bu vaxtda qılmağı onlara əmr edərdim."

İbn Abbas رضي الله عنهما Peyğəmbərin ﷺ əlini öz başına necə qoyduğunu izah edib demişdir: "O, barmaqlarını bir qədər aralayıb sonra barmaq uclarını başının yan tərəfinə qoydu, daha sonra barmaqlarını birləşdirib baş barmağı gicgahla saqqalın birləşdiyi tərəfdən qulaq mərcəyinə dəyənədək başına çəkdi. O, bunu nə tələsik, nə də yavaş etdi." (əl-Buxari, 571)

## ١٨– باب: وَقْتُ الْعِشَاءِ إِلَى نِصْفِ اللَّيْلِ

## 18-ci fəsil. İşa namazının vaxtı gecə yarısına qədərdir

٣٥٣ – وَ رَوَى أَنَسُ بْنُ مَالِكٍ رضي الله عنه هَذَا الحَدِيثَ فَقَالَ فِيهِ: كَأَنِّي أَنْظُرُ إِلَى وَبِيصِ خَاتَمِهِ لَيْلَتَئِذٍ. [رواه البخاري: ٥٧٢]

**353.** Ənəs ibn Malik ﷺ bu hədisi rəvayət etdikdə demişdir: “Mən o gecə Peyğəmbərin ﷺ barmağındakı üzüyün parladığını, sanki indi də görürəm.” (əl-Buxari, 572)

## 19-cu fəsil. Sübh namazının fəziləti

## ١٩– باب: فَضْلُ صَلاَةِ الفَجْرِ

**٣٥٤ –** عَنْ أَبِي مُوسَى ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَنْ صَلَّى الْبَرْدَيْنِ دَخَلَ الْجَنَّةَ». [رواه البخاري: ٥٧٤]

**354.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim sübh və əsr namazlarını qılarsa, Cənnətə girər.” (əl-Buxari, 574)

## 20-ci fəsil. Sübh namazının vaxtı

## ٢٠– باب: وَقْتُ الْفَجْرِ

**٣٥٥ –** عَنْ أَنَسٍ ﷺ: أَنَّ زَيْدَ بْنَ ثَابِتٍ ﷺ حَدَّثَهُ، أَنَّهُمْ تَسَحَّرُوا مَعَ النَّبِيِّ ﷺ ثُمَّ قَامُوا إِلَى الصَّلاَةِ. قُلْتُ كَمْ كَانَ بَيْنَهُمَا؟ قَالَ: قَدْرُ خَمْسِينَ أَوْ سِتِّينَ – يَعْنِي آيَةً. [رواه البخاري: ٥٧٥]

**355.** Ənəs ﷺ rəvayət edir ki, Zeyd ibn Sabit ﷺ ona Peyğəmbərlə ﷺ birlikdə səhur yeməyini[1] yediklərini, sonra da namaz qılmağa durduqlarını xəbər vermişdir.

(Ənəs ﷺ deyir): “Mən ondan soruşdum: “Səhurla namaz arasında nə qədər (vaxt) var idi?” O dedi: “(Bu vaxt ərzində) əlli və ya altmış ayə oxumaq olardı.” (əl-Buxari, 575)

**٣٥٦ –** عَنْ سَهْلِ بْنَ سَعْدٍ ﷺ قَالَ: كُنْتُ أَتَسَحَّرُ فِي أَهْلِي ثُمَّ يَكُونُ سُرْعَةٌ بِي أَنْ أُدْرِكَ صَلاَةَ الْفَجْرِ مَعَ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٥٧٧]

**356.** Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ demişdir: “Mən əhli-əyalımla səhur yeməyini yeyərdim, sonra da sübh namazını Peyğəmbərlə ﷺ birlikdə qılmağa çatmaq üçün tələsərdim.” (əl-Buxari, 577)

## 21-ci fəsil. Sübh namazından sonra günəş (üfüqdən) yüksələnədək namaz qılmağın (hökmü)

## ٢١– باب: الصَّلاَةُ بَعْدَ الْفَجْرِ حَتَّى تَرْتَفِعَ الشَّمْسُ

**٣٥٧ –** عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: شَهِدَ عِنْدِي رِجَالٌ مَرْضِيُّونَ وَأَرْضَاهُمْ عِنْدِي عُمَرُ، أَنَّ النَّبِيَّ ﷺ نَهَى عَنِ الصَّلاَةِ بَعْدَ الصُّبْحِ حَتَّى تَشْرُقَ الشَّمْسُ، وَبَعْدَ الْعَصْرِ حَتَّى تَغْرُبَ. [رواه البخاري: ٥٨١]

**357.** Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “(Dininə) sadiq möminlər və mənim üçün onların ən sadiqi sayılan Ömər ﷺ mənim yanımda şahidlik etdilər ki, Peyğəmbər ﷺ sübh namazından sonra günəş (üfüqdə bir nizə hündürlüyünə) qalxana qədər və əsr namazından sonra günəş batanadək (nafilə) namazı qılmağı qadağan etmişdi.” (əl-Buxari, 581)

---

[1] Oruc tutan müsəlmanın səhər-səhər dan yeri sökülməmişdən əvvəl yediyi yemək.

٣٥٨ – عَنْ ابْنُ عُمَرَ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لاَ تَحَرَّوْا بِصَلاَتِكُمْ طُلُوعَ الشَّمْسِ وَلاَ غُرُوبَهَا». [رواه البخاري: ٥٨٢]

**358.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Namazınızı günəşin çıxdığı və batdığı vaxta saxlamayın." (əl-Buxari, 582)

٣٥٩ – عَنْ ابْنُ عُمَرَ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِذَا طَلَعَ حَاجِبُ الشَّمْسِ فَأَخِّرُوا الصَّلاَةَ حَتَّى تَرْتَفِعَ، وَإِذَا غَابَ حَاجِبُ الشَّمْسِ فَأَخِّرُوا الصَّلاَةَ حَتَّى تَغِيبَ». [رواه البخاري: ٥٨٣]

**359.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Günəşin qövsü (üfüqdə) göründüyü zaman o, (bir nizə hündürlüyünə) qalxanadək namazı təxirə salın və günəşin qövsü batdığı zaman o, gözdən itənədək namazı təxirə salın." (əl-Buxari, 583)

٣٦٠ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه، أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ بَيْعَتَيْنِ وَعَنْ لِبْسَتَيْنِ تَقَدَّمَ وَ زَادَ وَ فِي هَذِهِ الرِّوَايَةِ: وَعَنْ صَلاَتَيْنِ نَهَى عَنِ الصَّلاَةِ بَعْدَ الْفَجْرِ حَتَّى تَطْلُعَ الشَّمْسُ، وَبَعْدَ الْعَصْرِ حَتَّى تَغْرُبَ الشَّمْسُ. [رواه البخاري: ٥٨٤]

**360.** (Əvvəldə keçən hədisdə[1]) Əbu Hureyra رضي الله عنه rəvayət etmişdir ki, Peyğəmbər ﷺ alış-verişin iki növünü və geyim qaydasının iki üsulunu qadağan etmişdir.

Bu hədisə əlavə edib demişdir: "İki (vaxtda) namaz qılmağı da qadağan etmişdir: sübh namazından sonra günəş (üfüqdə bir nizə hündürlüyünə) qalxana qədər və əsr namazından sonra günəş batanadək (namaz qılmağı qadağan etmişdir)." (əl-Buxari, 584)

## ٢٢– باب: لاَ يَتَحَرَّى الصَّلاَةَ قَبْلَ غُرُوبِ الشَّمْسِ

## 22-ci fəsil. Günəş batmamışdan əvvəl namaz qılınmamalıdır

٣٦١ – عَنْ مُعَاوِيَةَ رضي الله عنه قَالَ: إِنَّكُمْ لَتُصَلُّونَ صَلاَةً، لَقَدْ صَحِبْنَا رَسُولَ اللَّهِ ﷺ فَمَا رَأَيْنَاهُ يُصَلِّيهَا، وَلَقَدْ نَهَى عَنْهُمَا، يَعْنِي الرَّكْعَتَيْنِ بَعْدَ الْعَصْرِ. [رواه البخاري: ٥٨٧]

**361.** Rəvayət edilir ki, Müaviyə رضي الله عنه (əsrdən sonra iki rükət namaz qılanlara) demişdir: "Siz elə bir namaz qılırsınız ki, biz Peyğəmbərin ﷺ yanında ikən onun (belə vaxtda) namaz qıldığını görməmişik. O, bunu, – yəni əsrdən sonra iki rükət namaz qılmağı qadağan etmişdi." (əl-Buxari, 587)

## ٢٣– باب: مَا يُصَلَّى بَعْدَ الْعَصْرِ مِنَ الْفَوَائِتِ وَنَحْوِهَا

## 23-cü fəsil. Əsr namazından sonra, vaxtı keçmiş və digər bu kimi namazların qılınması

٣٦٢ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: وَالَّذِي ذَهَبَ بِهِ مَا تَرَكَهُمَا حَتَّى لَقِيَ اللَّهَ، وَمَا لَقِيَ اللَّهَ تَعَالَى حَتَّى ثَقُلَ عَنِ الصَّلاَةِ، وَكَانَ يُصَلِّي كَثِيرًا مِنْ صَلاَتِهِ قَاعِدًا، تَعْنِي الرَّكْعَتَيْنِ بَعْدَ الْعَصْرِ، وَكَانَ النَّبِيُّ ﷺ يُصَلِّيهِمَا، وَلاَ يُصَلِّيهِمَا فِي الْمَسْجِدِ مَخَافَةَ أَنْ يُثَقِّلَ عَلَى أُمَّتِهِ، وَكَانَ يُحِبُّ مَا يُخَفِّفُ عَنْهُمْ. [رواه البخاري: ٥٩٠]

[1] 241–ci hədisə bax.

**362.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbəri ﷺ (Öz yanına) aparan Allaha and olsun ki, o, Allaha qovuşanadək bu iki rükəti tərk etmədi, bu namazı (ayaq üstə) qılmaq ona ağır gələnədək (qocalıq onu haqlayanadək) Uca Allaha qovuşmamışdı, çox vaxt o, namazını – yəni əsrdən sonra (qıldığı) iki rükət namazı oturan yerdə qılardı, Peyğəmbər ﷺ bu iki rükəti (evdə) qılardı; o, ümmətinə çətin olacağından ehtiyat etdiyi üçün bu iki rükəti məsciddə qılmazdı və onların (işini) yüngülləşdirən hər şeyi sevərdi. (əl-Buxari, 590)

٣٦٣ – عَنْهَا ﵂ قَالَتْ: رَكْعَتَانِ لَمْ يَكُنْ رَسُولُ اللَّهِ ﷺ يَدَعُهُمَا سِرًّا وَلاَ عَلاَنِيَةً رَكْعَتَانِ قَبْلَ صَلاَةِ الصُّبْحِ، وَرَكْعَتَانِ بَعْدَ الْعَصْرِ. [رواه البخاري: ٥٩٢]

**363.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "İki rükət (namaz) vardır ki, Peyğəmbər ﷺ nə gizlində, nə də aşkarda – heç vaxt onları buraxmamışdır: iki rükət sübh namazından əvvəl, iki rükət də əsr namazından sonra." (əl-Buxari, 592)

## **24-cü fəsil.** (Namazın) **vaxtı keçdikdən sonra azan vermək**

## ٢٤ – باب: الأَذَانُ بَعْدَ ذَهَابِ الْوَقْتِ

٣٦٤ – عَنْ أَبِي قَتَادَةَ ﵁ قَالَ: سِرْنَا مَعَ النَّبِيِّ ﷺ لَيْلَةً فَقَالَ بَعْضُ الْقَوْمِ لَوْ عَرَّسْتَ بِنَا يَا رَسُولَ اللَّهِ، قَالَ: «أَخَافُ أَنْ تَنَامُوا عَنِ الصَّلاَةِ». قَالَ بِلاَلٌ أَنَا أُوقِظُكُمْ. فَاضْطَجَعُوا وَأَسْنَدَ بِلاَلٌ ظَهْرَهُ إِلَى رَاحِلَتِهِ، فَغَلَبَتْهُ عَيْنَاهُ فَنَامَ، فَاسْتَيْقَظَ النَّبِيُّ ﷺ وَقَدْ طَلَعَ حَاجِبُ الشَّمْسِ فَقَالَ: «يَا بِلاَلُ أَيْنَ مَا قُلْتَ». قَالَ: مَا أُلْقِيَتْ عَلَيَّ نَوْمَةٌ مِثْلُهَا قَطُّ. قَالَ: «إِنَّ اللَّهَ قَبَضَ أَرْوَاحَكُمْ حِينَ شَاءَ، وَرَدَّهَا عَلَيْكُمْ حِينَ شَاءَ، يَا بِلاَلُ قُمْ فَأَذِّنْ بِالنَّاسِ بِالصَّلاَةِ». فَتَوَضَّأَ فَلَمَّا ارْتَفَعَتِ الشَّمْسُ وَابْيَاضَّتْ قَامَ فَصَلَّى. [رواه البخاري: ٥٩٥]

**364.** Rəvayət edilir ki, Əbu Qətadə ﵁ demişdir: "Bir gecə biz Peyğəmbərlə ﷺ birlikdə səfərdə olarkən bəzi adamlar dedilər: "Ey Allahın elçisi, bizə dincimizi almağa izn versəydin, (yaxşı olardı)." Peyğəmbər ﷺ buyurdu: "Qorxuram ki, namaz vaxtı yatıb qalasınız." Bilal: "Mən sizi oyadaram"– dedi. Beləliklə, hamı uzanıb yatdı. Bilal kürəyini öz dəvəsinə söykədi (ki, yatmasın,) lakin onu da yuxu apardı. Nəhayət, Peyğəmbər ﷺ günəşin qövsü üfüqdə göründüyü vaxt oyandı və: "Ey Bilal, hanı verdiyin söz?"– deyə soruşdu. Bilal dedi: "Mən heç vaxt belə bərk yatmamışdım." Peyğəmbər ﷺ buyurdu: "Allah istədiyi vaxt canınızı alır və istədiyi vaxt da onu sizə qaytarır. Ey Bilal, qalx camaatı namaza çağır." Bundan sonra Peyğəmbər ﷺ dəstəmaz aldı və günəş artıq üfüqdən qalxıb parıldamağa başladıqdan sonra qalxıb namaz qıldı. (əl-Buxari, 595)

## **25-ci fəsil.** (Namazın) **vaxtı keçdikdən sonra camaata namaz qıldıran kimsə**

## ٢٥ – باب: مَنْ صَلَّى بِالنَّاسِ جَمَاعَةً بَعْدَ ذَهَابِ الْوَقْتِ

٣٦٥ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵄، أَنَّ عُمَرَ بْنَ الْخَطَّابِ جَاءَ يَوْمَ الْخَنْدَقِ بَعْدَ مَا غَرَبَتِ الشَّمْسُ، فَجَعَلَ يَسُبُّ كُفَّارَ قُرَيْشٍ قَالَ يَا رَسُولَ اللَّهِ مَا كِدْتُ أُصَلِّي الْعَصْرَ حَتَّى كَادَتِ الشَّمْسُ تَغْرُبُ. قَالَ النَّبِيُّ ﷺ: «وَاللَّهِ مَا صَلَّيْتُهَا». فَقُمْنَا إِلَى بُطْحَانَ، فَتَوَضَّأَ لِلصَّلاَةِ، وَتَوَضَّأْنَا لَهَا فَصَلَّى الْعَصْرَ بَعْدَ مَا غَرَبَتِ الشَّمْسُ، ثُمَّ صَلَّى بَعْدَهَا الْمَغْرِبَ. [رواه البخاري: ٥٩٦]

**365.** Cabir ibn Abdullah ﵄ rəvayət edir ki, Xəndək döyüşü əsnasında Ömər ibn Xəttab gün batandan sonra (müsəlmanların yanına) qayıtdı və Qureyş kafirlərini söyməyə başladı. Sonra dedi: "Ya Rəsulullah, mən əsr namazını gün batana yaxın qıldım." Peyğəmbər ﷺ buyurdu: "Vallahi, mən əsr namazını hələ qılmamışam." Sonra biz Buthana yollandıq. (Orada) Peyğəmbər ﷺ dəstəmaz aldı və biz də namaz qılmaq üçün dəstəmaz aldıq. Gün batandan sonra o, əsr namazını, arxasınca da məğrib namazını qıldırdı. (əl-Buxari, 596)

## ٢٦– باب: مَنْ نَسِيَ صَلاَةً فَلْيُصَلِّ إِذَا ذَكَرَهَا

## 26-cı fəsil. Namazını unudan kimsə, yadına düşən kimi onu qılmalıdır

٣٦٦ – عَنْ أَنَسٍ ﵁، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ نَسِيَ صَلاَةً فَلْيُصَلِّ إِذَا ذَكَرَهَا، لاَ كَفَّارَةَ لَهَا إِلاَّ ذَلِكَ: ﴿وَأَقِمِ ٱلصَّلَوٰةَ لِذِكۡرِيٓ﴾». [رواه البخاري: ٥٩٧]

**366.** Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim namazını unudarsa, qoy yadına düşən kimi onu qılsın. Unudulan namazın bundan başqa kəffarəsi yoxdur." (Uca Allah buyurur): "Məni xatırlamaq üçün namaz qıl!" (əl-Buxari, 597)

## ٢٧– باب

## 27-ci fəsil

٣٦٧ – عَنْهُ ﵁ قَالَ: قَالَ رَسُولُ اللهِ ﷺ: «لَمْ تَزَالُوا فِى صَلاَةٍ مَا انْتَظَرْتُمُ الصَّلاَةَ». [رواه البخاري: ٦٠٠]

**367.** Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Siz namazı gözlədiyiniz müddətdə namaz qılmış hesab olunursunuz.[1]" (əl-Buxari, 600)

## ٢٨– باب

## 28-ci fəsil

٣٦٨ – عَنْ بْنِ عُمَرَ ﵄ قَالَ: صَلَّى النَّبِيُّ ﷺ صَلاَةَ الْعِشَاءِ فِى آخر حَيَاته، فَلَمَّا سَلَّمَ قَامَ النَّبِيُّ ﷺ فَقَالَ: «أَرَأَيْتَكُمْ لَيْلَتَكُمْ هَذِهِ فَإِنَّ رَأْسَ مِائَةٍ لاَ يَبْقَى مِمَّنْ هُوَ الْيَوْمَ عَلَى ظَهْرِ الأَرْضِ أَحَدٌ». يُرِيدُ بِذَلِكَ أَنَّهَا تَخْرِمُ ذَلِكَ الْقَرْنَ. [رواه البخاري: ٦٠١]

**368.** İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ ömrünün axırında bizə işa namazını qıldırdı və salam verdikdən sonra ayağa qalxıb dedi: "Bilirsinizmi bu gecə hansı gecədir? Həqiqətən, yüz ilin tamamında bu gün yer üzündə olanlardan heç bir kimsə qalmayacaq.[2]"

Bunu deyəndə o, həmin gecədən etibarən yüz ilin tamamını qəsd edirdi. (əl-Buxari, 601)

٣٦٩ – عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِى بَكْرٍ ﵄، أَنَّ أَصْحَابَ الصُّفَّة كَانُوا أُنَاسًا فُقَرَاءَ، وَأَنَّ النَّبِيَّ ﷺ قَالَ: «مَنْ كَانَ عِنْدَهُ طَعَامُ اثْنَيْنِ فَلْيَذْهَبْ بِثَالِثٍ، وَإِنْ أَرْبَعٌ فَخَامِسٌ أَوْ سَادِسٌ». وَأَنَّ أَبَا بَكْرٍ جَاءَ بِثَلاَثَةٍ فَانْطَلَقَ النَّبِيُّ ﷺ

[1] Yəni bir o qədər savab qazanırsınız.

[2] Düz yüz il keçdikdən sonra hicrətin 110-cu ilində Peyğəmbərin ﷺ Əbu Tufeyl Amir ibn Vasilə əl-Leysi ﵁ adlı sonuncu əshabəsi vəfat etmişdir.

بعَشَرَة، قَالَ فَهُوَ أَنَا وَأَبِى وَأُمِّى، فَلاَ أَدْرِى قَالَ وَامْرَأَتِى وَخَادِمٌ بَيْنَنَا وَبَيْنَ بَيْت أَبِى بَكْر. وَإِنَّ أَبَا بَكْرٍ تَعَشَّى عِنْدَ النَّبِىِّ ﷺ ثُمَّ لَبِثَ حَيْثُ صُلِّيَت الْعِشَاءُ، ثُمَّ رَجعَ فَلَبثَ حَتَّى تَعَشَّى النَّبِىُّ ﷺ فَجَاءَ بَعْدَ مَا مَضَى مِنَ اللَّيْلِ مَا شَاءَ اللَّهُ ، قَالَتْ لَهُ امْرَأَتُهُ وَمَا حَبسَكَ عَنْ أَضْيَافكَ، أَوْ قَالَتْ ضَيْفكَ، قَالَ أَوَمَا عَشَّيْتيهمْ قَالَتْ أَبَوْا حَتَّى تَجِىءَ، قَدْ عُرِضُوا فَأَبَوْا. قَالَ فَذَهَبْتُ أَنَا فَاخْتَبَأْتُ فَقَالَ يَا غُنْثَرُ، فَجَدَّعَ وَسَبَّ، وَقَالَ كُلُوا لاَ هَنِيئًا. فَقَالَ وَاللَّه لاَ أَطْعَمُهُ أَبَدًا، وَايْمُ اللَّه مَا كُنَّا نَأْخُذُ منْ لُقْمَة إِلاَّ رَبَا منْ أَسْفَلهَا أَكْثَرُ منْهَا. قَالَ يَعْنِى حَتَّى شَبعُوا وَصَارَتْ أَكْثَرَ ممَّا كَانَتْ قَبْلَ ذَلكَ، فَنَظَرَ إِلَيْهَا أَبُو بَكْرٍ فَإِذَا هِىَ كَمَا هِىَ أَوْ أَكْثَرُ منْهَا. فَقَالَ لاِمْرَأَته يَا أُخْتَ بَنِى فِرَاسٍ مَا هَذَا قَالَتْ لاَ وَقُرَّة عَيْنِى لَهِىَ الآنَ أَكْثَرُ منْهَا قَبْلَ ذَلكَ بثَلاَث مَرَّات. فَأَكَلَ منْهَا أَبُو بَكْرٍ وَقَالَ إِنَّمَا كَانَ ذَلكَ منَ الشَّيْطَان - يَعْنِى يَمِينَهُ - ثُمَّ أَكَلَ منْهَا لُقْمَةً، ثُمَّ حَمَلَهَا إِلَى النَّبِىِّ ﷺ فَأَصْبَحَتْ عِنْدَهُ، وَكَانَ بَيْنَنَا وَبَيْنَ قَوْم عَقْدٌ، فَمَضَى الأَجَلُ، فَفَرَّقَنَا اثْنَا عَشَرَ رَجُلاً، مَعَ كُلِّ رَجُلٍ منْهُمْ أُنَاسٌ، اللَّهُ أَعْلَمُ كَمْ مَعَ كُلِّ رَجُلٍ فَأَكَلُوا منْهَا أَجْمَعُونَ، أَوْ كَمَا قَالَ. [رواه البخاري: ٦٠٢]

**369.** Rəvayət edilir ki, Abdur-Rəhman ibn Əbu Bəkr رضي الله عنهما demişdir: "Süffə[1] əhli kasıb adamlar idi. (Odur ki,) Peyğəmbər ﷺ buyurdu: "Kimin iki nəfərlik yeməyi varsa, qoy üçüncü bir adamı da (yeməyə) dəvət etsin, əgər dörd nəfərlikdirsə, beşincisini və ya altıncısını da (yeməyə çağırsın)." Əbu Bəkr üç nəfəri, Peyğəmbər ﷺ isə on nəfəri (evinə) apardı. Mən, anam və atam (bir evdə yaşayırdıq). (Hədisin ravisi demişdir ki, mən Abdur-Rəhmanın:) "Arvadım və Əbu Bəkrə qulluq edən xidmətçim də" deyib-demədiyini xatırlamıram.

(Abdur-Rəhman رضي الله عنهما deyir ki): "Əbu Bəkr Peyğəmbərin ﷺ yanında axşam yeməyini yedi, sonra da işa namazını qılana qədər gözlədi. Daha sonra geri qayıdıb Peyğəmbər ﷺ axşam yeməyini yeyənə qədər orada qaldı və gecənin bir hissəsi keçdikdən sonra evinə gəldi. Arvadı ondan soruşdu: "Qonaqlarının yanına gəlməyə sənə nə mane oldu?" O dedi: "Olmaya, onlara şam yeməyi verməmisən?" Arvadı dedi: "Onlar sən gələnədək (yemək) istəmədilər, qabaqlarına yemək qoyuldu, lakin imtina etdilər."

(Abdur-Rəhman رضي الله عنهما) deyir ki: "Mən (atamın qorxusundan) qaçıb gizləndim." Atam isə: "Ay həşərat!"– deyə qışqırıb (məni) danladı. (Yemək süfrəyə gətirildikdən sonra) dedi: "Yeyin, onsuz da canınıza sinməyəcək! Vallahi, mən o yeməkdən yeməyəcəyəm!"

(Abdur-Rəhman رضي الله عنهما) deyir ki: "Allaha and olsun ki, biz (hər dəfə) bir loxma götürdükcə altından (yemək) daha da artırdı. Nəhayət, hamı yeyib doydu və yemək əvvəlkindən daha çox oldu. Əbu Bəkr yeməyə baxıb onun olduğu kimi qaldığını və ya daha da artdığını görəndə arvadına dedi: "Ey Firas oğullarının bacısı, bu nədir?" Qadın dedi: "Gözün aydın! İndi yemək əvvəlkindən üç dəfə artıq olmuşdur!" Beləliklə, Əbu Bəkr رضي الله عنه də o yeməkdən yedi və (yeməyə toxunmayacağına dair) and içməsini qəsd edərək: "Bu, şeytanın işidir"– dedi. O, yeməkdən bir loxma da yedikdən sonra onu Peyğəmbərin ﷺ yanına apardı və yemək səhərə qədər onun yanında qaldı. (O vaxta qədər) bizimlə bir qəbilə arasında saziş bağlanmışdı ki, artıq onun müddəti bitmişdi. Biz (bu qəbilədən) on iki nəfər seçdik; (onlardan) hər birinin yanında Allaha məlum olan sayda adamlar var idi, onların hamısı bu xörəkdən yedi" və ya buna bənzər bir söz dedi. (əl-Buxari, 602)

[1] Süffə – Peyğəmbər ﷺ məscidinin içində, üstü talvarla örtülmüş bir yerdir. Mədinədə ev-eşiyi və malmülkü olmayan əshabələr burada qalırdılar. Bu səbəbdən də onlara süffə əhli deyirdilər.

# ١٠ – كِتَابُ الآذَانِ

# 10 – Azan kitabı

## ١– باب: بَدْءُ الأَذَانِ

## 1-ci fəsil. Azanın başlanması

٣٧٠ – عَنْ ابْنَ عُمَرَ رضي الله عنهما كَانَ يَقُولُ: كَانَ الْمُسْلِمُونَ حِينَ قَدِمُوا الْمَدِينَةَ يَجْتَمِعُونَ فَيَتَحَيَّنُونَ الصَّلاَةَ، لَيْسَ يُنَادَى لَهَا، فَتَكَلَّمُوا يَوْمًا فِي ذَلِكَ، فَقَالَ بَعْضُهُمْ اتَّخِذُوا نَاقُوسًا مِثْلَ نَاقُوسِ النَّصَارَى. وَقَالَ بَعْضُهُمْ بَلْ بُوقًا مِثْلَ قَرْنِ الْيَهُودِ. فَقَالَ عُمَرُ أَوَلاَ تَبْعَثُونَ رَجُلاً يُنَادِي بِالصَّلاَةِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «يَا بِلاَلُ قُمْ فَنَادِ بِالصَّلاَةِ». [رواه البخاري: ٦٠٤]

**370.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, müsəlmanlar Mədinəyə hicrət etdikdən sonra (əvvəl-əvvəl) namaz vaxtını təqribi hesablayıb bir yerə toplaşardılar. Çünki o vaxt heç kəs (camaatı) namaza çağırmırdı. Bir gün müsəlmanlar bu haqda söhbət açdılar və onların bəzisi dedi: "Xristianlar kimi zəng çalın." Bəziləri də: "Yox, yəhudilər kimi buynuzabənzər bir alətdən istifadə edin"– dedi. Ömər isə dedi: "Bəlkə bir adam təyin edəsiniz (camaatı) namaza çağırsın?" Peyğəmbər ﷺ buyurdu: "Ey Bilal, qalx, (camaatı) namaza çağır!" (əl-Buxari, 604)

## ٢– باب: الأَذَانُ مَثْنَى مَثْنَى

## 2-ci fəsil. Azanın (sözlərinin) iki dəfə təkrar edilməsi

٣٧١ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: أُمِرَ بِلاَلٌ أَنْ يَشْفَعَ الأَذَانَ وَأَنْ يُوتِرَ الإِقَامَةَ إِلاَّ الإِقَامَةَ. [رواه البخاري: ٥٠٦]

**371.** Rəvayət olunur ki, Ənəs رضي الله عنه demişdir: "Bilala azanın sözlərini cüt sayda, iqaməni isə "qad qamətis-saləh" sözləri istisna olmaqla, tək sayda oxumaq əmr edilmişdi." (əl-Buxari, 506)

## ٣– باب: فَضْلُ التَّأْذِينِ

## 3-cü fəsil. Azanın fəziləti

٣٧٢ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا نُودِيَ لِلصَّلاَةِ أَدْبَرَ الشَّيْطَانُ وَلَهُ ضُرَاطٌ حَتَّى لاَ يَسْمَعَ التَّأْذِينَ، فَإِذَا قَضَى النِّدَاءَ أَقْبَلَ، حَتَّى إِذَا ثُوِّبَ بِالصَّلاَةِ أَدْبَرَ، حَتَّى إِذَا قَضَى التَّثْوِيبَ أَقْبَلَ حَتَّى يَخْطُرَ بَيْنَ الْمَرْءِ وَنَفْسِهِ، يَقُولُ اذْكُرْ كَذَا، اذْكُرْ كَذَا لِمَا لَمْ يَكُنْ يَذْكُرُ، حَتَّى يَظَلَّ الرَّجُلُ لاَ يَدْرِي كَمْ صَلَّى». [رواه البخاري: ٦٠٨]

**372.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Namaz üçün azan veriləndə şeytan bərkdən yel buraxaraq qaçır ki, bu çağırışı eşitməsin, azan qurtardıqda isə geri qayıdır. İqamə veriləndə yenə dönüb qaçır, iqamə bitdikdə isə geri qayıdır və nəhayət, insanla onun qəlbi arasında dayanıb ona: "Filan şeyi və filan şeyi yadına sal"– deyərək (namazı qurtarana qədər) onun yadına düşmədiyi şeyləri ona təlqin edir. Axırda o adam neçə (rükət) qıldığını (yadına sala) bilmir". (əl-Buxari, 608)

## 4-cü fəsil. Azanın uca səslə oxunması

## ٤– باب: رَفْعُ الصَّوْتِ بِالنِّدَاءِ

٣٧٣ – عَنْ أَبِي سَعِيد الْخُدْرِيِّ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِنَّهُ لاَ يَسْمَعُ مَدَى صَوْتِ الْمُؤَذِّنِ جِنٌّ وَلاَ إِنْسٌ وَلاَ شَيْءٌ إِلاَّ شَهِدَ لَهُ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٦٠٩]

**373.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Müəzzinin səsini eşidən elə bir cin, elə bir insan və elə bir məxluq yoxdur ki, Qiyamət günü ona şahidlik etməsin." (əl-Buxari, 609)

## 5-ci fəsil. Azan qan tökülməsinin qarşısını alır

## ٥– باب: مَا يُحْقَنُ بِالأَذَانِ مِنَ الدِّمَاءِ

٣٧٤ – عَنْ أَنَسِ بْنِ مَالِك ﷺ، أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا غَزَا بِنَا قَوْمًا لَمْ يَكُنْ يَغْزُو بِنَا حَتَّى يُصْبِحَ وَيَنْظُرَ، فَإِنْ سَمِعَ أَذَانًا كَفَّ عَنْهُمْ، وَإِنْ لَمْ يَسْمَعْ أَذَانًا أَغَارَ عَلَيْهِمْ. [رواه البخاري: ٦١٠]

**374.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ hər hansı bir qövmün üstünə getdikdə səhər açılanadək onlara hücum etməyib gözləyərdi – əgər (oradan) azan səsi eşitsəydi, (onlarla vuruşmaqdan) vaz keçər, azan eşitməsəydi, onlara hücum edərdi. (əl-Buxari, 610)

## 6-cı fəsil. Adam müəzzinin səsini eşitdikdə nə deməlidir

## ٦– باب: مَا يَقُولُ إِذَا سَمِعَ الْمُنَادِى

٣٧٥ – عَنْ أَبِى سَعِيدِ الْخُدْرِيِّ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا سَمِعْتُمُ النِّدَاءَ فَقُولُوا مِثْلَ ما يَقُولُ الْمُؤَذِّنُ». [رواه البخاري: ٦١١]

**375.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Azanı eşidəndə müəzzinin dediklərini təkrar edin." (əl-Buxari, 611)

٣٧٦ – عَنْ مُعَاوِيَةَ ﷺ مِثْلَهُ إِلَى قَوْله: «وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ» وَ لَمَّا قَالَ: «حَيَّ عَلَى الصَّلاَة، قَالَ: لاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ» وَقَالَ هَكَذَا سَمِعْنَا نَبِيَّكُمْ ﷺ يَقُولُ. [رواه البخاري: ٦١٢]

**376.** Rəvayət edilir ki, Müaviyə ﷺ (müəzzinin dediklərini): "Əşhədu ənnə Muhəmmədən rəsulullah" [1] sözlərinə qədər təkrar etdi və (müəzzin): "Hayyə aləs-saləh" [2] deyəndə o: "Lə həulə və lə quvvətə illə billəh" [3] dedi. Axırda da buyurdu: "Biz Peyğəmbərimizin ﷺ belə dediyini eşitmişik." (əl-Buxari, 612)

---

[1] Yəni, mən şahidlik edirəm ki, Muhəmməd Allahın elçisidir.
[2] Yəni, namaza tələsin!
[3] Yəni, qüdrət və güc yalnız Allahdadır!

## 7-ci fəsil. Azan bitdikdən sonra oxunan dua

## ٧– باب: الدُّعَاءُ عِنْدَ النِّدَاءِ

٣٧٧ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَنْ قَالَ حِينَ يَسْمَعُ النِّدَاءَ اللَّهُمَّ رَبَّ هَذِهِ الدَّعْوَةِ التَّامَّةِ وَالصَّلاَةِ الْقَائِمَةِ آتِ مُحَمَّدًا الْوَسِيلَةَ وَالْفَضِيلَةَ وَابْعَثْهُ مَقَامًا مَحْمُودًا الَّذِى وَعَدْتَهُ، حَلَّتْ لَهُ شَفَاعَتِى يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٦١٤]

**377.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Hər kim azanı eşitdikdə: "Allahummə Rabbə həzihid-dəvətit-tammə, vəssəlatil qaimə, ati Muhəmmədənil-vəsilətə vəl-fədilətə, vəb'ashu məqamən məhmudənilləzi vəadtəhu"[1]– desə, Qiyamət günü mənim şəfaətimə qovuşar. (əl-Buxari, 614)

## 8-ci fəsil. Azan vermək üçün püşk atmaq[2]

## ٨– باب: الاِسْتِهَامُ فِى الأَذَانِ

٣٧٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لَوْ يَعْلَمُ النَّاسُ مَا فِى النِّدَاءِ وَالصَّفِّ الأَوَّلِ، ثُمَّ لَمْ يَجِدُوا إِلاَّ أَنْ يَسْتَهِمُوا عَلَيْهِ لاَسْتَهَمُوا، وَلَوْ يَعْلَمُونَ مَا فِى التَّهْجِيرِ لاَسْتَبَقُوا إِلَيْهِ، وَلَوْ يَعْلَمُونَ مَا فِى الْعَتَمَةِ وَالصُّبْحِ لأَتَوْهُمَا وَلَوْ حَبْوًا». [رواه البخاري: ٦١٥]

**378.** Əbu Hureyra ﷺ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Əgər insanlar azan (verməyin) və (namazda) birinci sırada (durmağın nə qədər xeyirli və bərəkətli) olduğunu bilsəydilər və (buna nail olmaq üçün) püşk atmaqdan başqa bir çarə tapmasaydılar, hökmən püşk atardılar; əgər onlar namazın vaxtı yetişən kimi onu qılmağın (nə qədər xeyirli və bərəkətli) olduğunu bilsəydilər, onu yerinə yetirmək üçün bir-birini ötüb keçməyə çalışardılar; və əgər onlar işa və sübh namazlarını (camaatla birgə) qılmağın (nə qədər xeyirli və bərəkətli) olduğunu bilsəydilər, bu namazları qılmaq üçün dizləri üstündə sürünə-sürünə də olsa (məscidə) gələrdilər." (əl-Buxari, 615)

## 9-cu fəsil. Namaz vaxtının yetişdiyini kor adama xəbər verən olarsa, onda o da azan verə bilər

## ٩– باب: أَذَانُ الأَعْمَى إِذَا كَانَ لَهُ مَنْ يُخْبِرُهُ

٣٧٩ – عَنِ ابْنِ عُمَرَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِنَّ بِلاَلاً يُؤَذِّنُ بِلَيْلٍ، فَكُلُوا وَاشْرَبُوا حَتَّى يُنَادِىَ ابْنُ أُمِّ مَكْتُومٍ». قَالَ: وَكَانَ رَجُلاً أَعْمَى لاَ يُنَادِى حَتَّى يُقَالَ لَهُ أَصْبَحْتَ أَصْبَحْتَ. [رواه البخاري: ٦١٧]

**379.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bilal gecə azan verir. Siz ibn Ummu Məktum azan verənədək yeyin-için."

---

[1] Tərcüməsi: "Bu tam dəvətin və qılınacaq namazın Rəbbi olan Allahım! Muhəmmədə vasitəçilik haqqı və fəzilət ver. Onu vəd etdiyin tərifl ənən məqama çatdır."

[2] Bir mübahisəni həll etmək, yaxud bir şeyə haqqı olduğunu və ya bir şeyin üsul və qaydasını müəyyən etmək üçün eyni cür nişanlar arasından bəxtəbəxt götürülən nişan. O dövrdə ərəblər oxların üstündə adlarını yazardılar, sonra da onlardan birini çəkərdilər.

(Bu hədisi rəvayət edən ravilərdən biri) demişdir: "İbn Ummu Məktum kor idi və ona: "Səhər açılır, səhər açılır" deyilməyincə o, azan oxumazdı." (əl-Buxari, 617)

## 10-cu fəsil. Dan yeri söküldükdən sonra azan vermək

## ١٠- باب: الأَذَانُ بَعْدَ الْفَجْرِ

٣٨٠ – عَنْ حَفْصَةَ رضي الله عنها، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا اعْتَكَفَ الْمُؤَذِّنُ لِلصُّبْحِ وَبَدَا الصُّبْحُ صَلَّى رَكْعَتَيْنِ خَفِيفَتَيْنِ قَبْلَ أَنْ تُقَامَ الصَّلاَةُ. [رواه البخاري: ٦١٨]

**380.** Həfsə rəvayət edir ki, müəzzin sübh namazı üçün azan verib qurtaranda və artıq dan yeri sökülləndə Peyğəmbər ﷺ iqamədən əvvəl iki xəfif rükətli namaz qılardı." (əl-Buxari, 618)

## 11-ci fəsil. Dan yeri sökülməmişdən əvvəl azan vermək

## ١١- باب: الأَذَانُ قَبْلَ الْفَجْرِ

٣٨١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ رضي الله عنه، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لاَ يَمْنَعَنَّ أَحَدَكُمْ أَوْ أَحَدًا مِنْكُمْ أَذَانُ بِلاَلٍ مِنْ سَحُورِهِ، فَإِنَّهُ يُؤَذِّنُ - أَوْ يُنَادِي - بِلَيْلٍ، لِيَرْجِعَ قَائِمَكُمْ وَلِيُنَبِّهَ نَائِمَكُمْ، وَلَيْسَ أَنْ يَقُولَ الْفَجْرُ أَوِ الصُّبْحُ». وَقَالَ بِأَصَابِعِهِ وَرَفَعَهَا إِلَى فَوْقُ وَطَأْطَأَ إِلَى أَسْفَلُ حَتَّى يَقُولَ هَكَذَا. وَقَالَ يُشِيرُ بِسَبَّابَتَيْهِ إِحْدَاهُمَا فَوْقَ الأُخْرَى ثُمَّ مَدَّهَا عَنْ يَمِينِهِ وَشِمَالِهِ. [رواه البخاري: ٦٢١]

**381.** Abdullah ibn Məsud rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bilalın azan oxuması sizə səhur yeməyinizi yeməyə mane olmamalıdır. Çünki o, gecə namazını qılanlarınızı xəbərdar etmək və yatanlarınızı oyatmaq üçün gecə vaxtı azan verir. Bu isə dan yerinin sökülməsi və ya sübh namazının vaxtının başlanması demək deyildir." (Bunu deyəndən sonra) o, barmaqlarını yuxarı qaldırıb aşağı endirərək işarə etdi.

(Hədisi danışan ravi) şəhadət barmağını orta barmağının üstünə qoyduqdan sonra onları özündən sağa və sola işarə etdi.[1] (əl-Buxari, 621)

## 12-ci fəsil. Hər kim istəsə, iki azan[2] arasında namaz qıla bilər

## ١٢- باب: بَيْنَ كُلِّ أَذَانَيْنِ صَلاَةٌ لِمَنْ شَاءَ

٣٨٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مُغَفَّلٍ الْمُزَنِيِّ رضي الله عنه، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «بَيْنَ كُلِّ أَذَانَيْنِ صَلاَةٌ – ثَلاثاً – لِمَنْ شَاءَ» وَ فِي رِوَايَةٍ: «بَيْنَ كُلِّ أَذَانَيْنِ صَلاَةٌ، بَيْنَ كُلِّ أَذَانَيْنِ صَلاَةٌ» ثُمَّ قَالَ فِي الثَّالِثَةِ: «لِمَنْ شَاءَ». [رواه البخاري: ٦٢٧]

**382.** Abdullah ibn Müğəffəl əl-Müzəni rəvayət edir ki, Peyğəmbər ﷺ üç dəfə dedi: "Hər iki azan arasında namaz vardır", (sonra da əlavə etdi): "(Bunu) istəyənlər üçün."

---

[1] O, bununla dan yerinin bütün üfüq boyu necə söküldüyünü qəsd edirdi.
[2] Burada iki azan deyildikdə azan və iqamə nəzərdə tutulur.

Digər rəvayətdə deyilir ki, (Peyğəmbər ﷺ): "Hər iki azan arasında namaz vardır, hər iki azan arasında namaz vardır"– demiş və üçüncü dəfə: "(Bunu) istəyənlər üçün"- deyə əlavə etmişdir. (əl-Buxari, 627)

## ١٣– باب: مَنْ قَالَ لِيُؤَذِّنْ فِى السَّفَرِ مُؤَذِّنٌ وَاحِدٌ

## 13-cü fəsil. "Qoy səfərdə azanı bir müəzzin versin"– deyən kimsə

٣٨٣ – عَنْ مَالِك بْنِ الْحُوَيْرِث رضي الله عنه قَالَ: أَتَيْتُ النَّبِىَّ ﷺ فِى نَفَرٍ مِنْ قَوْمِى فَأَقَمْنَا عِنْدَهُ عِشْرِينَ لَيْلَةً، وَكَانَ رَحِيمًا رَفِيقًا، فَلَمَّا رَأَى شَوْقَنَا إِلَى أَهَالِينَا قَالَ: «ارْجِعُوا فَكُونُوا فِيهِمْ وَعَلِّمُوهُمْ وَصَلُّوا، فَإِذَا حَضَرَتِ الصَّلاَةُ فَلْيُؤَذِّنْ لَكُمْ أَحَدُكُمْ وَلْيَؤُمَّكُمْ أَكْبَرُكُمْ». [رواه البخاري: ٦٢٨]

**383.** Rəvayət edilir ki, Malik ibn Huveyris رضي الله عنه demişdir: "Mən qəbiləmizdən olan bir neçə adamla birlikdə Peyğəmbərin ﷺ yanına gəldim və biz iyirmi gün onun yanında qaldıq. O (bizimlə) çox mehriban və mülayim rəftar edirdi. Nəhayət, bizim ailələrimiz üçün darıxdığımızı görüb dedi: "Qayıdın, onların yanında olun, (bu dini) onlara öyrədin, (onlara) namaz qıldırın, namaz vaxtı yetişdiyi zaman, qoy biriniz azan verib sizi namaza çağırsın və sizin ən yaşlı olanınız sizə namaz qıldırsın." (əl-Buxari, 628)

٣٨٤ – عَنْهُ رضي الله عنه فِي رِوَايَةٍ: أَتَى رَجُلاَنِ النَّبِىَّ ﷺ يُرِيدَانِ السَّفَرَ فَقَالَ النَّبِىُّ ﷺ: «إِذَا أَنْتُمَا خَرَجْتُمَا فَأَذِّنَا ثُمَّ أَقِيمَا ثُمَّ لِيَؤُمَّكُمَا أَكْبَرُكُمَا». [رواه البخاري: ٦٣٠]

**384.** Digər rəvayətdə Malik ibn Huveyris رضي الله عنه demişdir: "Səfərə çıxmaq istəyən iki nəfər Peyğəmbərin ﷺ yanına gəldi və Peyğəmbər ﷺ (onlara) belə buyurdu: "Səfərdə olduğunuz zaman (namaz vaxtı yetişdikdə) azan oxuyun, sonra iqamə verin, sonra isə qoy ən yaşlı olanınız sizə namaz qıldırsın." (əl-Buxari, 630)

## ١٤– باب: الأَذَانُ وَالإِقَامَةُ لِلْمُسَافِرِ إِذَا كَانُوا جَمَاعَةً

## 14-cü fəsil. Müsafirlər (səfərdə) bir camaat olduqda azan və iqamə verməyin zəruriliyi

٣٨٥ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَأْمُرُ مُؤَذِّنًا يُؤَذِّنُ، ثُمَّ يَقُولُ عَلَى إِثْرِهِ، «أَلاَ صَلُّوا فِى الرِّحَالِ» فِى اللَّيْلَةِ الْبَارِدَةِ أَوِ الْمَطِيرَةِ فِى السَّفَرِ. [رواه البخاري: ٦٣٢]

**385.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, soyuq və ya yağışlı gecədə, səfərdə olarkən Peyğəmbər ﷺ müəzzinə azan verməyi əmr edər və azan bitdikdən sonra buyurardı: "Namazınızı evinizdə qılın." (əl-Buxari, 632)

## ١٥– باب: قَوْلُ الرَّجُلِ فَاتَتْنَا الصَّلاَةُ

## 15-ci fəsil. (Namaza tələsən) adamın: "Biz namazı buraxmışıq"– deməsi

٣٨٦ – عَنْ أَبِى قَتَادَةَ رضي الله عنه قَالَ: بَيْنَمَا نَحْنُ نُصَلِّى مَعَ النَّبِىِّ ﷺ إِذْ سَمِعَ جَلَبَةَ رِجَالٍ فَلَمَّا صَلَّى قَالَ: «مَا شَأْنُكُمْ». قَالُوا اسْتَعْجَلْنَا إِلَى الصَّلاَةِ. قَالَ: «فَلاَ تَفْعَلُوا، إِذَا أَتَيْتُمُ الصَّلاَةَ فَعَلَيْكُمْ بِالسَّكِينَةِ، فَمَا أَدْرَكْتُمْ فَصَلُّوا وَمَا فَاتَكُمْ فَأَتِمُّوا». [رواه البخاري: ٦٣٥]

**386.** Rəvayət edilir ki, Əbu Qətadə ﷺ demişdir: “Biz Peyğəmbərlə ﷺ birlikdə namaz qılarkən o, (namaza gələn) adamların hay-küyünü eşitdi. Namazı bitirdikdən sonra soruşdu: “Nə olub sizə?” Onlar dedilər: “Biz namaza tələsirdik.” Peyğəmbər ﷺ dedi: “(Bir də) belə etməyin! Namaza gələndə sakitcə gəlin. Hansı (rükətə) çatsanız, (onu imamla birlikdə) qılın, buraxdıqlarınızı isə (fərdi şəkildə) tamamlayın.” (əl-Buxari, 635)

## 16-cı fəsil. Camaat iqamə verilərkən imamı gördükdə nə vaxt ayağa qalxmalıdır?

## ١٦– باب: مَتَى يَقُومُ النَّاسُ إِذَا رَأَوُا الإِمَامَ عِنْدَ الإِقَامَةِ

**٣٨٧** – عَنْهُ ﷺ قَالَ، قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِذَا أُقِيمَتِ الصَّلاَةُ فَلاَ تَقُومُوا حَتَّى تَرَوْنِى». [رواه البخاري: ٦٣٧]

**387.** Əbu Qətadə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Namaza iqamə verildikdə məni (qarşınızda) görənə qədər ayağa qalxmayın.” (əl-Buxari, 637)

## 17-ci fəsil. İqamə oxunduqdan sonra imamın zəruri bir işlə məşğul olması

## ١٧– باب: الإِمَامُ تَعْرِضُ لَهُ الْحَاجَةُ بَعْدَ الإِقَامَةِ

**٣٨٨** – عَنْ أَنَسٍ ﷺ قَالَ: أُقِيمَتِ الصَّلاَةُ وَالنَّبِيُّ ﷺ يُنَاجِى رَجُلاً فِى جَانِبِ الْمَسْجِدِ، فَمَا قَامَ إِلَى الصَّلاَةِ حَتَّى نَامَ الْقَوْمُ. [رواه البخاري: ٦٤٢]

**388.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “(Bir dəfə) namaza iqamə verildi, Peyğəmbər ﷺ isə hələ də məscidin bir tərəfində kiminləsə gizli söhbət edirdi. O, namaz qılmaq üçün ayağa qalxanda (əshabələrdən) bəziləri artıq yuxulamışdı.” (əl-Buxari, 642)

## 18-ci fəsil. Camaatla namaz qılmağın vacib olması

## ١٨– باب: وُجُوبُ صَلاَةِ الْجَمَاعَةِ

**٣٨٩** – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «وَالَّذِى نَفْسِى بِيَدِهِ لَقَدْ هَمَمْتُ أَنْ آمُرَ بِحَطَبٍ فَيُحْطَبَ، ثُمَّ آمُرَ بِالصَّلاَةِ فَيُؤَذَّنَ لَهَا، ثُمَّ آمُرَ رَجُلاً فَيَؤُمَّ النَّاسَ، ثُمَّ أُخَالِفَ إِلَى رِجَالٍ فَأُحَرِّقَ عَلَيْهِمْ بُيُوتَهُمْ، وَالَّذِى نَفْسِى بِيَدِهِ لَوْ يَعْلَمُ أَحَدُهُمْ أَنَّهُ يَجِدُ عَرْقًا سَمِينًا أَوْ مِرْمَاتَيْنِ حَسَنَتَيْنِ لَشَهِدَ الْعِشَاءَ». [رواه البخاري: ٦٤٤]

**389.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Canım Əlində olan Allaha and olsun ki, mən istərdim əmr edəm, odun yığsınlar, sonra əmr edəm, (camaatı) namaza çağırmaq üçün azan versinlər, sonra da bir adama camaata namaz qıldırmağı tapşıram və namaza gəlməyən kişilərin evinə gedib onların evlərini yandırıb kül edəm. Canım Əlində olan Allaha and olsun ki, əgər onlardan birisi (burada) ona üstündə yağlı ət parçası olan sümük və ya bir cüt qoyun dırnağı veriləcəyini bilsəydi, mütləq işa namazına gələrdi.” (əl-Buxari, 644)

## ١٩– باب: فَضْلُ صَلاَةِ الْجَمَاعَةِ

## 19-cu fəsil. Camaat namazının fəziləti

٣٩٠ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «صَلاَةُ الْجَمَاعَةِ تَفْضُلُ صَلاَةَ الْفَذِّ بِسَبْعٍ وَعِشْرِينَ دَرَجَةً». [رواه البخاري: ٦٤٥]

**390.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Camaat namazı fərdi namazdan iyirmi yeddi dərəcə üstündür." (əl-Buxari, 645)

## ٢٠– باب: فَضْلُ صَلاَةِ الْفَجْرِ فِى جَمَاعَةٍ

## 20-ci fəsil. Camaatla qılınan sübh namazının fəziləti

٣٩١ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «تَفْضُلُ صَلاَةُ الْجَمِيعِ صَلاَةَ أَحَدِكُمْ وَحْدَهُ بِخَمْسٍ وَعِشْرِينَ جُزْءًا، وَتَجْتَمِعُ مَلاَئِكَةُ اللَّيْلِ وَمَلاَئِكَةُ النَّهَارِ فِى صَلاَةِ الْفَجْرِ». يَقُولُ: فَاقْرَءُوا إِنْ شِئْتُمْ: ﴿إِنَّ قُرْءَانَ ٱلْفَجْرِ كَانَ مَشْهُودًا﴾. [رواه البخاري: ٦٤٨]

**391.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Camaat namazı birinizin fərdi şəkildə qıldığı namazdan iyirmi beş dəfə üstündür və gecə mələkləri ilə gündüz mələkləri sübh namazında bir yerə toplaşırlar." (Əbu Hureyra) dedi: "İstəyirsinizsə, (bu ayəni) oxuyun: **"...sübh çağı oxunan Quranın[1] şahidləri olur."**[2] (əl-Buxari, 648)

٣٩٢ – عَنْ أَبِى مُوسَى رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «أَعْظَمُ النَّاسِ أَجْرًا فِى الصَّلاَةِ أَبْعَدُهُمْ فَأَبْعَدُهُمْ مَمْشًى، وَالَّذِى يَنْتَظِرُ الصَّلاَةَ حَتَّى يُصَلِّيَهَا مَعَ الإِمَامِ أَعْظَمُ أَجْرًا مِنَ الَّذِى يُصَلِّى ثُمَّ يَنَامُ». [رواه البخاري: ٦٥١]

**392.** Əbu Musa رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Camaatla birlikdə) namaz qıldıqlarına görə ən böyük mükafatı o kəslər qazanırlar ki, onlar (məscidə gələndə) ən uzaq məsafəni qət edirlər. İmamla birgə namaz qılmaq üçün namazı gözləyənin mükafatı isə namazı qılan kimi yıxılıb-yatan kimsənin mükafatından daha böyükdür." (əl-Buxari, 651)

## ٢١– باب: فَضْلُ التَّهْجِيرِ إِلَى الظُّهْرِ

## 21-ci fəsil. Zöhr namazının (ilkin) vaxtında qılınmasının fəziləti

٣٩٣ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «بَيْنَمَا رَجُلٌ يَمْشِى بِطَرِيقٍ وَجَدَ غُصْنَ شَوْكٍ عَلَى الطَّرِيقِ فَأَخَّرَهُ، فَشَكَرَ اللَّهُ لَهُ، فَغَفَرَ لَهُ».
ثُمَّ قَالَ: «الشُّهَدَاءُ خَمْسَةٌ الْمَطْعُونُ، وَالْمَبْطُونُ ، وَالْغَرِيقُ، وَصَاحِبُ الْهَدْمِ، وَالشَّهِيدُ فِى سَبِيلِ اللَّهِ». [رواه البخاري: ٦٥٢-٦٥٣]

---

[1] Bu vaxt qılınan fəcr namazını gecə mələkləri ilə gündüz mələkləri müşahidə edirlər.
[2] "əl-İsra" surəsi, 78.

**393.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir nəfər yolla gedərkən yolun üstündə tikanlı bir budaq gördü və onu götürüb kənara atdı. Allah da onun (əməlini) bəyəndi və onun (günahlarını) bağışladı."

Sonra buyurdu: "Beş nəfər şəhid sayılır: taundan[1] ölənlər, qarın xəstəliklərindən ölənlər, suda boğulanlar, uçqunlar altında qalıb ölənlər və Allah yolunda (vuruşub) şəhid olanlar." (əl-Buxari, 652-653)

## 22-ci fəsil. İzləri hesablamaq[2]

## ٢٢- باب: احْتِسَابُ الآثَارِ

٣٩٤ – عَنْ أَنَسٍ ﷺ، أَنَّ بَنِي سَلِمَةَ أَرَادُوا أَنْ يَتَحَوَّلُوا عَنْ مَنَازِلِهِمْ فَيَنْزِلُوا قَرِيبًا مِنَ النَّبِيِّ ﷺ قَالَ فَكَرِهَ رَسُولُ اللَّهِ ﷺ أَنْ يُعْرُوا الْمَدِينَةَ فَقَالَ: «أَلاَ تَحْتَسِبُونَ آثَارَكُمْ». [رواه البخاري: ٦٥٦]

**394.** Ənəs ﷺ rəvayət edir ki, Sələmə oğulları öz evlərindən köçüb Peyğəmbərə ﷺ yaxın bir yerdə məskunlaşmaq istəyirdilər. Lakin Peyğəmbər ﷺ istəmirdi ki, onlar Mədinənin (ətrafını) boş qoysunlar və buyurdu: "Məgər siz (ayaq) izlərinizi hesablamırsınız?" (əl-Buxari, 656)

## 23-cü fəsil. Camaatla qılınan işa namazının fəziləti

## ٢٣- باب: فَضْلُ الْعِشَاءِ فِي الْجَمَاعَةِ

٣٩٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «لَيْسَ صَلاَةٌ أَثْقَلَ عَلَى الْمُنَافِقِينَ مِنَ الْفَجْرِ وَالْعِشَاءِ، وَلَوْ يَعْلَمُونَ مَا فِيهِمَا لأَتَوْهُمَا وَلَوْ حَبْوًا». [رواه البخاري: ٦٥٧]

**395.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Münafiqlər üçün sübh və işa namazlarından daha ağır namaz yoxdur. Əgər onlar bu iki namazın nə qədər (xeyirli və bərəkətli) olduğunu bilsəydilər, bu namazları qılmaq üçün dizləri üstündə sürünə-sürünə də olsa (məscidə) gələrdilər." (əl-Buxari, 657)

## 24-cü fəsil. Məsciddə oturub namazı gözləyən kimsə (barəsində) və məscidlərin fəziləti (haqqında)

## ٢٤- باب: مَنْ جَلَسَ فِي الْمَسْجِدِ يَنْتَظِرُ الصَّلاَةَ، وَفَضْلِ الْمَسَاجِدِ

٣٩٦ – وَ عَنْهُ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «سَبْعَةٌ يُظِلُّهُمُ اللَّهُ فِي ظِلِّهِ يَوْمَ لاَ ظِلَّ إِلاَّ ظِلُّهُ الإِمَامُ الْعَادِلُ، وَشَابٌّ نَشَأَ فِي عِبَادَةِ رَبِّهِ، وَرَجُلٌ قَلْبُهُ مُعَلَّقٌ فِي الْمَسَاجِدِ، وَرَجُلاَنِ تَحَابَّا فِي اللَّهِ اجْتَمَعَا عَلَيْهِ وَتَفَرَّقَا عَلَيْهِ، وَرَجُلٌ طَلَبَتْهُ امْرَأَةٌ ذَاتُ مَنْصِبٍ وَجَمَالٍ فَقَالَ إِنِّي أَخَافُ اللَّهَ. وَرَجُلٌ تَصَدَّقَ أَخْفَى حَتَّى لاَ تَعْلَمَ شِمَالُهُ مَا تُنْفِقُ يَمِينُهُ، وَرَجُلٌ ذَكَرَ اللَّهَ خَالِيًا فَفَاضَتْ عَيْنَاهُ». [رواه البخاري: ٦٦٠]

---

[1] Qusma və ishal şəklində təzahür edən, yoluxucu ağır epidemik xəstəlik.

[2] Burada namaza gedən insanların evindən məscidə qədər atdığı hər addıma görə qazandıqları savabın hesablanması nəzərdə tutulur.

**396.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yeddi qisim insan vardır ki, Allah onları Öz kölgəsindən başqa heç bir kölgənin olmayacağı bir gündə Öz kölgəsi altında kölgələndirəcəkdir: (bunlar) ədalətli rəhbər, Rəbbinə ibadət etməklə böyüyüb boya-başa çatmış gənc, qəlbi məscidlərə bağlı olan kişi, bir-birini Allah xatirinə sevən, Onun yolunda birləşib, Onun yolunda ayrılan iki nəfər, gözəl və zadəgan bir qadın tərəfindən zinaya çağırıldıqda: "mən Allahdan qorxuram!"– deyən kişi, sağ əli ilə verdiyi sədəqəni sol əlindən gizlədən adam və xəlvətə çəkilib Allahı yad etdikdən sonra gözləri yaşla dolan kişi (və ya qadındır)." (əl-Buxari, 660)

## ٢٥– باب: فَضْلُ مَنْ غَدَا إِلَى الْمَسْجِدِ وَمَنْ رَاحَ

## 25-ci fəsil. Səhər və axşamüstü məscidə gedənin fəziləti

٣٩٧ – وَ عَنْهُ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ غَدَا إِلَى الْمَسْجِدِ وَرَاحَ أَعَدَّ اللَّهُ لَهُ نُزُلَهُ مِنَ الْجَنَّةِ كُلَّمَا غَدَا أَوْ رَاحَ».
[رواه البخاري: ٦٦٢]

**397.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim səhər və axşamüstü məscidə gedərsə, hər gedişində Allah onun üçün Cənnətdə bir yer hazırlayar." (əl-Buxari, 662)

## ٢٦– باب: إِذَا أُقِيمَتِ الصَّلاَةُ فَلاَ صَلاَةَ إِلاَّ الْمَكْتُوبَةَ

## 26-cı fəsil. İqamə oxunduqdan sonra fərz namazından başqa namaz qılmaq olmaz

٣٩٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَالِكٍ ابْنِ بُحَيْنَةَ، رَجُلٌ مِنَ الأَزْدِ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ رَأَى رَجُلاً وَقَدْ أُقِيمَتِ الصَّلاَةُ يُصَلِّي رَكْعَتَيْنِ، فَلَمَّا انْصَرَفَ رَسُولُ اللَّهِ ﷺ لاَثَ بِهِ النَّاسُ، وَقَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ: «الصُّبْحَ أَرْبَعًا، الصُّبْحَ أَرْبَعًا».
[رواه البخاري: ٦٦٣]

**398.** Əzd qəbiləsindən olan Abdullah ibn Malik ibn Buheynə ﷺ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ iqamə verildikdən sonra bir adamın iki rükət namaz qıldığını gördü. Peyğəmbər ﷺ namazı bitirdikdən sonra camaat onun ətrafına yığışdı və o (həmin adamdan): "Sübh namazını dörd rükətmi (qıldın)? Sübh namazını dörd rükətmi (qıldın)?"– deyə soruşdu. (əl-Buxari, 663)

## ٢٧– باب: حَدُّ الْمَرِيضِ أَنْ يَشْهَدَ الْجَمَاعَةَ

## 27-ci fəsil. Xəstə hansı halda camaat namazında iştirak edə bilər

٣٩٩ – عَنْ عَائِشَةَ رضى الله عنها قَالَتْ: لَمَّا مَرِضَ رَسُولُ اللَّهِ ﷺ مَرَضَهُ الَّذِى مَاتَ فِيهِ، فَحَضَرَتِ الصَّلاَةُ فَأُذِّنَ، فَقَالَ: «مُرُوا أَبَا بَكْرٍ فَلْيُصَلِّ بِالنَّاسِ». فَقِيلَ لَهُ إِنَّ أَبَا بَكْرٍ رَجُلٌ أَسِيفٌ، إِذَا قَامَ فِى مَقَامِكَ لَمْ يَسْتَطِعْ أَنْ يُصَلِّيَ بِالنَّاسِ، وَأَعَادَ فَأَعَادُوا لَهُ، فَأَعَادَ الثَّالِثَةَ فَقَالَ: «إِنَّكُنَّ صَوَاحِبُ يُوسُفَ، مُرُوا أَبَا بَكْرٍ فَلْيُصَلِّ بِالنَّاسِ». فَخَرَجَ أَبُو بَكْرٍ فَصَلَّى، فَوَجَدَ النَّبِيُّ ﷺ مِنْ نَفْسِهِ خِفَّةً، فَخَرَجَ يُهَادَى بَيْنَ رَجُلَيْنِ كَأَنِّى أَنْظُرُ رِجْلَيْهِ تَخُطَّانِ مِنَ

الْوَجَعِ، فَأَرَادَ أَبُو بَكْرٍ أَنْ يَتَأَخَّرَ، فَأَوْمَأَ إِلَيْهِ النَّبِيُّ ﷺ أَنْ مَكَانَكَ، ثُمَّ أُتِيَ بِهِ حَتَّى جَلَسَ إِلَى جَنْبِهِ. وَكَانَ النَّبِيُّ ﷺ يُصَلِّي وَأَبُو بَكْرٍ يُصَلِّي بِصَلَاتِهِ، وَالنَّاسُ يُصَلُّونَ بِصَلَاةِ أَبِي بَكْرٍ.
وَ فِي رِوَايَةٍ: جَلَسَ عَنْ يَسَارِ أَبِي بَكْرٍ فَكَانَ أَبُو بَكْرٍ يُصَلِّي قَائِمًا. [رواه البخاري: ٦٦٤]

**399.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ ölümü ilə nəticələnən xəstəliyə tutulduğu zaman namaz vaxtı yetişdikdən və azan verildikdən sonra buyurdu: "Əbu Bəkrə deyin, camaata namaz qıldırsın!" Ona dedilər ki: "Əbu Bəkr ürəyiyumşaq[1] adamdır, əgər sənin yerinə imamlıq etsə, camaata namaz qıldıra bilməyəcək." Peyğəmbər ﷺ sözünü təkrar etdi, yanındakılar da ona eyni cavabı verdilər, üçüncü dəfə o buyurdu: "Siz Yusufa gözü düşən qadınlar kimisiniz.[2] Əbu Bəkrə deyin, camaata namaz qıldırsın!" Beləlilkə, Əbu Bəkr (məscidə) gedib camaata namaz qıldırmağa başladı. Bu əsnada Peyğəmbərin ﷺ halı yaxşılaşdı və iki nəfər onun (sağından və solundan) qoluna girib onu (məscidə) apardı. Mən onun xəstəliyi üzündən ayaqlarını yerlə sürüdüyünü, sanki, indi də görürəm. Əbu Bəkr (onun gəldiyini hiss etdikdə) geriyə çəkilmək istədi, lakin Peyğəmbər ﷺ əli ilə ona işarə etdi ki, yerində qal. Sonra onu (imamın durduğu yerə) apardılar və o, Əbu Bəkrin yanında (yerə) oturdu. Peyğəmbər ﷺ namaz qılmağa başladı, Əbu Bəkr namazına davam etdi və camaat da Əbu Bəkrə tabe olaraq namaz qıldı.

Digər rəvayətdə deyilir ki, Peyğəmbər ﷺ Əbu Bəkrin sol tərəfində (yerə) oturdu, Əbu Bəkr isə ayaq üstə namaz qıldı. (əl-Buxari, 664)

٤٠٠ – عَنْهَا ﵂، فِي رِوَايَةٍ قَالَتْ: لَمَّا ثَقُلَ النَّبِيُّ ﷺ وَاشْتَدَّ وَجَعُهُ اسْتَأْذَنَ أَزْوَاجَهُ أَنْ يُمَرَّضَ فِي بَيْتِي فَأَذِنَّ لَهُ. [رواه البخاري: ٦٦٥]

**400.** Başqa bir rəvayətdə Aişə ﵂ demişdir: "Peyğəmbərin ﷺ vəziyyəti ağırlaşdığı və ağrıları şiddətləndiyi zaman o, öz zövcələrindən xahiş etdi ki, ona mənim evimdə baxsınlar və onlar da buna razılıq verdilər." (əl-Buxari, 665)

## 28-ci fəsil. İmam namazı ancaq (xütbədə) iştirak edənlərəmi qıldırmalıdır və yağış yağarkən o, cümə xütbəsi söyləməlidirmi?

## ٢٨- باب: هَلْ يُصَلِّي الإِمَامُ بِمَنْ حَضَرَ وَهَلْ يَخْطُبُ يَوْمَ الْجُمُعَةِ فِي الْمَطَرِ

٤٠١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ الحَارِثِ قَالَ: خَطَبَنَا ابْنُ عَبَّاسٍ ﵄ فِي يَوْمٍ ذِي رَدْغٍ، فَأَمَرَ الْمُؤَذِّنَ، لَمَّا بَلَغَ حَيَّ عَلَى الصَّلَاةِ. قَالَ: قُلِ الصَّلَاةُ فِي الرِّحَالِ، فَنَظَرَ بَعْضُهُمْ إِلَى بَعْضٍ، فَكَأَنَّهُمْ أَنْكَرُوا فَقَالَ كَأَنَّكُمْ أَنْكَرْتُمْ هَذَا إِنَّ هَذَا فَعَلَهُ مَنْ هُوَ خَيْرٌ مِنِّي – يَعْنِي النَّبِيَّ ﷺ إِنَّهَا عَزْمَةٌ، وَإِنِّي كَرِهْتُ أَنْ أُحْرِجَكُمْ. [رواه البخاري: ٦٦٨]

[1] Aişə ﵂ onun Quran oxuduqda ağlayacağını qəsd edir.

[2] Yusufu ﵇ yoldan çıxartmaq istəyən qadın şəhərdəki qadınların onu bu əməlinə görə məzəmmət etdiyini eşidəndə onlar üçün qonaqlıq təşkil etmiş, məqsədi isə Yusufu ﵇ onlara göstərmək olmuşdur. Peyğəmbər ﷺ onları məsəl çəkməklə demək istəyir ki, qadınların danışdıqları sözlə məqsədləri çox vaxt ziddiyyətli olur. Burada Aişə ﵂ atasının ürəyiyumşaq olduğunu desə də, əslində qorxurdu ki, camaat onu Peyğəmbərin ﷺ yerində görsə, bunu bəd əlamət hesab edər və onun xəstəliyini Əbu Bəkrlə ﵁ əlaqələndirər. (Fəthul-Bari, 2/492).

**401.** Abdullah ibn əl-Haris ﷺ rəvayət edir ki, yağışlı bir gündə, hər yan palçıq içində ikən ibn Abbas ﷺ xütbə söyləyirdi. Müəzzin (azan verərkən): "Hayyə aləs-saləh" sözünə çatdıqda ibn Abbas ona belə buyurdu: "(Camaata) bildir ki, namazı evlərində qılsınlar." (Xütbədə iştirak edənlər bunu eşitdikdə) bir-birlərinə baxdılar, sanki bu onların xoşuna gəlmədi. Odur ki, ibn Abbas dedi: "Deyəsən, bu sizin xoşunuza gəlmədi. Lakin məndən də xeyirli olan birisi, yəni Peyğəmbər ﷺ belə etmişdir. Düzdür, cümə (namazında iştirak etmək) vacibdir, ancaq mən sizi əziyyətə salmaq istəmirdim." (əl-Buxari, 668)

**٤٠٢** – عَنْ أَنَسٍ ﷺ قَالَ: قَالَ رَجُلٌ مِنَ الأَنْصَارِ: إِنِّى لاَ أَسْتَطِيعُ الصَّلاَةَ مَعَكَ. وَكَانَ رَجُلاً ضَخْمًا، فَصَنَعَ لِلنَّبِيِّ ﷺ طَعَامًا فَدَعَاهُ إِلَى مَنْزِلِهِ، فَبَسَطَ لَهُ حَصِيرًا وَنَضَحَ طَرَفَ الْحَصِيرِ، صَلَّى عَلَيْهِ رَكْعَتَيْنِ. فَقَالَ رَجُلٌ مِنْ آلِ الْجَارُودِ لأَنَسٍ: أَكَانَ النَّبِيُّ ﷺ يُصَلِّى الضُّحَى؟ قَالَ: مَا رَأَيْتُهُ صَلاَّهَا إِلاَّ يَوْمَئِذٍ. [رواه البخاري: ٦٧٠]

**402.** Ənəs ﷺ rəvayət edir ki, ənsardan olan kök bir kişi dedi: "Mən səninlə birlikdə (məsciddə) namaz qıla bilmirəm." Sonra (gedib) Peyğəmbər ﷺ üçün yemək hazırladı, onu evinə dəvət etdi, onun üçün yerə həsir saldı, həsirin kənarlarına su çilədi və Peyğəmbər ﷺ bu həsirin üstündə iki rükət namaz qıldı.

Carud nəslindən olan bir nəfər Ənəsdən soruşdu: "Peyğəmbər ﷺ (hər gün) duha namazını qılardımı?" Ənəs dedi: "Mən onun o gündən başqa (nə vaxtsa) bu namazı qıldığını görmədim." (əl-Buxari, 670)

## ٢٩– باب: إِذَا حَضَرَ الطَّعَامُ وَأُقِيمَتِ الصَّلاَةُ

## 29-cu fəsil. İqamə oxunduqdan sonra süfrəyə yemək verilərsə (nə etməli?)

**٤٠٣** – عَنهُ ﷺ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا قُدِّمَ الْعَشَاءُ فَابْدَءُوا بِهِ قَبْلَ أَنْ تُصَلُّوا صَلاَةَ الْمَغْرِبِ، وَلاَ تَعْجَلُوا عَنْ عَشَائِكُمْ». [رواه البخاري: ٦٧٢]

**403.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Süfrəyə) şam yeməyi verilərsə, məğrib namazını qılmamışdan əvvəl şam yeməyinə başlayın və yeməyinizi yedikdə tələsməyin." (əl-Buxari, 672)

## ٣٠– باب: مَنْ كَانَ فِى حَاجَةِ أَهْلِهِ فَأُقِيمَتِ الصَّلاَةُ فَخَرَجَ

## 30-cu fəsil. Ev işlərində ailəsinə köməklik edən və iqamə verildikdən sonra namaza gedən kimsə haqqında

**٤٠٤** – عَنْ عَائِشَةَ ﷺ أَنَّهَا سُئِلَتْ عَنِ النَّبِيِّ ﷺ مَا كَانَ يَصْنَعُ فِى بَيْتِهِ؟ قَالَتْ: كَانَ يَكُونُ فِى مِهْنَةِ أَهْلِهِ تَعْنِى خِدْمَةَ أَهْلِهِ، فَإِذَا حَضَرَتِ الصَّلاَةُ خَرَجَ إِلَى الصَّلاَةِ. [رواه البخاري: ٦٧٦]

**404.** Rəvayət edilir ki, Aişədən ﷺ: "Peyğəmbər ﷺ evdə nə işlə məşğul olurdu?"– deyə soruşdular. Aişə dedi: "O, ev işlərində əhli-əyalına köməklik edər, namaz vaxtı yetişdikdə isə namaza gedərdi." (əl-Buxari, 676)

## 31-ci fəsil. Peyğəmbərin ﷺ qıldığı namazı, habelə onun qoyduğu Sünnəni insanlara öyrətmək məqsədilə onlara namaz qıldıran kimsə

## ٣١– باب: مَنْ صَلَّى بِالنَّاسِ وَهْوَ لاَ يُرِيدُ إِلاَّ أَنْ يُعَلِّمَهُمْ صَلاَةَ النَّبِيِّ ﷺ وَسُنَّتَهُ

٤٠٥ – عَنْ مَالِكُ بْنُ الْحُوَيْرِثِ ؓ قَالَ: إِنِّي لأُصَلِّي بِكُمْ، وَمَا أُرِيدُ الصَّلاَةَ، أُصَلِّي كَيْفَ رَأَيْتُ النَّبِيَّ ﷺ يُصَلِّي. [رواه البخاري: ٦٧٧]

**405.** Rəvayət edilir ki, Malik ibn Huveyris ؓ demişdir: “Hərçənd, (indi) mən namaz qılmaq istəmirəm, lakin mən sizə namaz qıldıracağam[1]. Peyğəmbərin ﷺ necə namaz qıldığını görmüşəmsə, elə də namaz qılıram.” (əl-Buxari, 677)

## 32-ci fəsil. Elmi və hörməti olan kəslər camaata namaz qıldırmağa daha haqlıdırlar

## ٣٢– باب: أَهْلُ الْعِلْمِ وَالْفَضْلِ أَحَقُّ بِالإِمَامَةِ

٤٠٦ – عَنْ عَائِشَةَ رضى الله عنها أَنَّهَا قَالَتْ إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ فِى مَرَضِه: «مُرُوا أَبَا بَكْرٍ يُصَلِّى بِالنَّاسِ». قَالَتْ عَائِشَةُ: قُلْتُ إِنَّ أَبَا بَكْرٍ إِذَا قَامَ فِى مَقَامِكَ لَمْ يُسْمِعِ النَّاسَ مِنَ الْبُكَاءِ، فَمُرْ عُمَرَ فَلْيُصَلِّ لِلنَّاسِ. فَقَالَتْ عَائِشَةُ فَقُلْتُ لِحَفْصَةَ قُولِى لَهُ إِنَّ أَبَا بَكْرٍ إِذَا قَامَ فِى مَقَامِكَ لَمْ يُسْمِعِ النَّاسَ مِنَ الْبُكَاءِ، فَمُرْ عُمَرَ فَلْيُصَلِّ لِلنَّاسِ. فَفَعَلَتْ حَفْصَةُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَهْ، إِنَّكُنَّ لأَنْتُنَّ صَوَاحِبُ يُوسُفَ، مُرُوا أَبَا بَكْرٍ فَلْيُصَلِّ لِلنَّاسِ». فَقَالَتْ حَفْصَةُ لِعَائِشَةَ مَا كُنْتُ لأُصِيبَ مِنْكِ خَيْرًا. [رواه البخاري: ٦٧٩]

**406.** Rəvayət edilir ki, Aişə ؓ demişdir: “Peyğəmbər ﷺ xəstələndiyi zaman buyurdu: “Əbu Bəkrə deyin, camaata namaz qıldırsın!” Mən dedim: “Əbu Bəkr sənin yerinə imamlıq etsə, onun ağlamağı üzündən camaat heç nə eşidə bilməyəcək. Buna görə də camaata namaz qıldırmağı Ömərə həvalə et.”

Aişə deyir ki: “Mən Həfsəyə dedim: “Peyğəmbərə ﷺ de ki, Əbu Bəkr onun yerinə imamlıq etsə, onun ağlamağı üzündən camaat heç nə eşidə bilməyəcək. Elə isə qoy camaata namaz qıldırmağı Ömərə həvalə etsin.” Həfsə belə də etdi. Lakin Peyğəmbər ﷺ dedi: “Yetər! Həqiqətən, siz Yusufa gözü düşən qadınlar kimisiniz.[2] Əbu Bəkrə deyin, camaata namaz qıldırsın!”

Bundan sonra Həfsə Aişəyə dedi: “Mən heç vaxt səndən xeyir görmədim.” (əl-Buxari, 679)

٤٠٧ – عَنْ أَنَسُ بْنُ مَالِكٍ ؓ، أَنَّ أَبَا بَكْرٍ كَانَ يُصَلِّي لَهُمْ فِي وَجَعِ النَّبِيِّ ﷺ الَّذِي تُوُفِّيَ فِيهِ، حَتَّى إِذَا كَانَ يَوْمُ الاِثْنَيْنِ وَهُمْ صُفُوفٌ فِي الصَّلاَةِ، فَكَشَفَ النَّبِيُّ ﷺ سِتْرَ الْحُجْرَةِ يَنْظُرُ إِلَيْنَا، وَهْوَ قَائِمٌ كَأَنَّ وَجْهَهُ وَرَقَةُ مُصْحَفٍ، ثُمَّ تَبَسَّمَ يَضْحَكُ، فَهَمَمْنَا أَنْ نَفْتَتِنَ مِنَ الْفَرَحِ بِرُؤْيَةِ النَّبِيِّ ﷺ، فَنَكَصَ أَبُو بَكْرٍ عَلَى عَقِبَيْهِ لِيَصِلَ الصَّفَّ، وَظَنَّ أَنَّ النَّبِيَّ ﷺ خَارِجٌ إِلَى الصَّلاَةِ ، فَأَشَارَ إِلَيْنَا النَّبِيُّ ﷺ أَنْ أَتِمُّوا صَلاَتَكُمْ، وَأَرْخَى السِّتْرَ، فَتُوُفِّيَ مِنْ يَوْمِهِ. [رواه البخاري: ٦٨٠]

---

[1] Malik ibn Huveyrisin ؓ bu namazı qılmaqda məqsədi vacib, yaxud sünnə olan bir əməli yerinə yetirmək yox, məhz Peyğəmbərin ﷺ necə namaz qıldığını göstərmək idi.

[2] 399-cu hədisin izahına bax.

**407.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ vəfatına səbəb olan xəstəliyə tutulduğu zaman (yatağa düşdükdə) camaata namazı Əbu Bəkr qıldırırdı. Nəhayət, bazar ertəsi camaat namaz qılmaq üçün cərgəbəcərgə düzüldükdə Peyğəmbər ﷺ (qaldığı) hücrənin pərdəsini qaldırdı və ayaq üstə dayanıb bizə baxmağa başladı. Onun üzü, sanki Quran kağızı[1] idi. Sonra o gülümsədi. Biz Peyğəmbəri ﷺ görəndə sevincimizdən az qaldı ki, namazdan çıxaq. Əbu Bəkr Peyğəmbərin ﷺ namaz qılacağını zənn etdi və dala çəkilərək arxasındakı cərgəyə keçdi. Peyğəmbər ﷺ bizə "Namazınızı tamamlayın" işarəsi etdi. Sonra pərdəni aşağı saldı və həmin gün də vəfat etdi. (əl-Buxari, 680)

## ٣٣- باب: مَنْ دَخَلَ لِيَؤُمَّ النَّاسَ فَجَاءَ الإِمَامُ الأَوَّلُ

## 33-cü fəsil. (İmamı əvəz edən) **kimsə camaata namaz qıldırmağa başladıqdan sonra həmişə namazı qıldıran imamın gəlib çıxması**

٤٠٨ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ السَّاعِدِيِّ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ ذَهَبَ إِلَى بَنِي عَمْرِو بْنِ عَوْفٍ لِيُصْلِحَ بَيْنَهُمْ فَحَانَتِ الصَّلاَةُ فَجَاءَ الْمُؤَذِّنُ إِلَى أَبِي بَكْرٍ فَقَالَ أَتُصَلِّي لِلنَّاسِ فَأُقِيمَ قَالَ نَعَمْ. فَصَلَّى أَبُو بَكْرٍ، فَجَاءَ رَسُولُ اللَّهِ ﷺ وَالنَّاسُ فِي الصَّلاَةِ، فَتَخَلَّصَ حَتَّى وَقَفَ فِي الصَّفِّ، فَصَفَّقَ النَّاسُ، وَكَانَ أَبُو بَكْرٍ لاَ يَلْتَفِتُ فِي صَلاَتِهِ، فَلَمَّا أَكْثَرَ النَّاسُ التَّصْفِيقَ الْتَفَتَ فَرَأَى رَسُولَ اللَّهِ ﷺ، فَأَشَارَ إِلَيْهِ رَسُولُ اللَّهِ ﷺ أَنِ امْكُثْ مَكَانَكَ، فَرَفَعَ أَبُو بَكْرٍ رضى الله عنه يَدَيْهِ، فَحَمِدَ اللَّهَ عَلَى مَا أَمَرَهُ بِهِ رَسُولُ اللَّهِ ﷺ مِنْ ذَلِكَ، ثُمَّ اسْتَأْخَرَ أَبُو بَكْرٍ حَتَّى اسْتَوَى فِي الصَّفِّ، وَتَقَدَّمَ رَسُولُ اللَّهِ ﷺ فَصَلَّى، فَلَمَّا انْصَرَفَ قَالَ: «يَا أَبَا بَكْرٍ مَا مَنَعَكَ أَنْ تَثْبُتَ إِذْ أَمَرْتُكَ». فَقَالَ أَبُو بَكْرٍ مَا كَانَ لاِبْنِ أَبِي قُحَافَةَ أَنْ يُصَلِّيَ بَيْنَ يَدَيْ رَسُولِ اللَّهِ ﷺ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَا لِي رَأَيْتُكُمْ أَكْثَرْتُمُ التَّصْفِيقَ مَنْ رَابَهُ شَيْءٌ فِي صَلاَتِهِ فَلْيُسَبِّحْ، فَإِنَّهُ إِذَا سَبَّحَ الْتُفِتَ إِلَيْهِ، وَإِنَّمَا التَّصْفِيقُ لِلنِّسَاءِ». [رواه البخاري: ٦٨٤]

**408.** Səhl ibn Səd əs-Saidi ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Amr ibn Auf oğullarının yanına getmişdi ki, onların arasını düzəltsin. Bu əsnada namaz vaxtı yetişdi və müəzzin Əbu Bəkrin yanına gəlib dedi: "Camaata namaz qıldıracaqsansa, iqaməni verim?" Əbu Bəkr: "Bəli!"– deyə cavab verdi. Beləliklə, Əbu Bəkr (camaata) namaz qıldırdı. Camaat namazda ikən Peyğəmbər ﷺ qayıdıb gəldi və cərgələrin arasından keçib birinci cərgədə durdu. Bu vaxt camaat əl çalmağa başladı, lakin Əbu Bəkr namaz qılarkən başını arxaya çevirməzdi. Camaat bərkdən əl çalmağa başladıqda o, arxaya çevrildi və Peyğəmbəri ﷺ gördü. Peyğəmbər ﷺ əli ilə ona işarə etdi ki, yerində qal. Belə olduqda Əbu Bəkr əllərini göyə qaldırıb Peyğəmbərin ﷺ ona verdiyi əmrə görə Allaha həmd-səna dedi. Sonra da arxaya çəkilib (birinci) cərgədə durdu. Peyğəmbər ﷺ isə önə keçib (camaata) namaz qıldırdı. Namazı bitirdikdən sonra dedi: "Ey Əbu Bəkr, sənə əmr etdiyim halda yerində qalmağına mane olan nə idi?" Əbu Bəkr dedi: "Əbu Quhafənin[2] oğluna Peyğəmbərin ﷺ qarşısında namaz qılmaq yaraşmazdı." Sonra Peyğəmbər ﷺ (camaata) dedi: "Niyə siz bu qədər çox əl çaldınız? Hər kim namaz əsnasında özündə şübhə doğuran bir şey (görsə), qoy: "Subhanəllah!"[3]– desin.

---

[1] Burada Peyğəmbərin ﷺ üzünün gözəlliyi, ağlığı və nuraniliyi nəzərdə tutulur.
[2] Əbu Quhafə Əbu Bəkrin ﷺ atasının kunyasıdır. 92-ci hədisin qeydlərinə bax.
[3] Allah pak və müqəddəsdir.

Əgər: “Subhanəllah!”– desə, ona diqqət yetirilər. Əl çalmaq isə qadınlara aiddir. (əl-Buxari, 684)

## 34-cü fəsil. İmam ona görə təyin olunmuşdur ki, (arxasında) namaz qılanlar ona tabe olsunlar

## ٣٤– باب: إِنَّمَا جُعِلَ الإِمَامُ لِيُؤْتَمَّ بِهِ

٤٠٩ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: لَمَّا ثَقُلَ النَّبِيُّ ﷺ قَالَ: «أَصَلَّى النَّاسُ؟» قُلْنَا لاَ، هُمْ يَنْتَظِرُونَكَ. قَالَ: «ضَعُوا لِي مَاءً فِي الْمِخْضَبِ» قَالَتْ فَفَعَلْنَا فَاغْتَسَلَ فَذَهَبَ لِيَنُوءَ فَأُغْمِيَ عَلَيْهِ، ثُمَّ أَفَاقَ فَقَالَ ﷺ: «أَصَلَّى النَّاسُ؟» قُلْنَا لاَ، هُمْ يَنْتَظِرُونَكَ يَا رَسُولَ اللَّهِ، قَالَ: «ضَعُوا لِي مَاءً فِي الْمِخْضَبِ» قَالَتْ فَقَعَدَ فَاغْتَسَلَ، ثُمَّ ذَهَبَ لِيَنُوءَ فَأُغْمِيَ عَلَيْهِ، ثُمَّ أَفَاقَ فَقَالَ: «أَصَلَّى النَّاسُ؟» قُلْنَا لاَ، هُمْ يَنْتَظِرُونَكَ يَا رَسُولَ اللَّهِ، فَقَالَ: «ضَعُوا لِي مَاءً فِي الْمِخْضَبِ»، فَقَعَدَ فَاغْتَسَلَ، ثُمَّ ذَهَبَ لِيَنُوءَ فَأُغْمِيَ عَلَيْهِ، ثُمَّ أَفَاقَ فَقَالَ: «أَصَلَّى النَّاسُ؟» فَقُلْنَا لاَ، هُمْ يَنْتَظِرُونَكَ يَا رَسُولَ اللَّهِ، وَالنَّاسُ عُكُوفٌ فِي الْمَسْجِدِ يَنْتَظِرُونَ النَّبِيَّ ﷺ لِصَلاَةِ الْعِشَاءِ الآخِرَةِ فَأَرْسَلَ النَّبِيُّ ﷺ إِلَى أَبِي بَكْرٍ بِأَنْ يُصَلِّيَ بِالنَّاسِ، فَأَتَاهُ الرَّسُولُ فَقَالَ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ يَأْمُرُكَ أَنْ تُصَلِّيَ بِالنَّاسِ، فَقَالَ أَبُو بَكْرٍ – وَكَانَ رَجُلاً رَقِيقًا – يَا عُمَرُ صَلِّ بِالنَّاسِ، فَقَالَ لَهُ عُمَرُ: أَنْتَ أَحَقُّ بِذَلِكَ، فَصَلَّى أَبُو بَكْرٍ تِلْكَ الأَيَّامَ، ثُمَّ إِنَّ النَّبِيَّ ﷺ وَجَدَ مِنْ نَفْسِهِ خِفَّةً فَخَرَجَ بَيْنَ رَجُلَيْنِ أَحَدُهُمَا الْعَبَّاسُ لِصَلاَةِ الظُّهْرِ، وَأَبُو بَكْرٍ يُصَلِّي بِالنَّاسِ، فَلَمَّا رَآهُ أَبُو بَكْرٍ ذَهَبَ لِيَتَأَخَّرَ فَأَوْمَأَ إِلَيْهِ النَّبِيُّ ﷺ بِأَنْ لاَ يَتَأَخَّرَ، قَالَ: «أَجْلِسَانِي إِلَى جَنْبِهِ»، فَأَجْلَسَاهُ إِلَى جَنْبِ أَبِي بَكْرٍ، قَالَ فَجَعَلَ أَبُو بَكْرٍ يُصَلِّي وَهْوَ يَأْتَمُّ بِصَلاَةِ النَّبِيِّ ﷺ وَالنَّاسُ بِصَلاَةِ أَبِي بَكْرٍ، وَالنَّبِيُّ ﷺ قَاعِدٌ. [رواه البخاري: ٦٨٧]

**409.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbərin ﷺ vəziyyəti ağırlaşdığı zaman soruşdu: “Camaat namaz qılıbmı?” Biz dedik: “Xeyr, onlar səni gözləyirlər.” O dedi: “Təknəyə[1] mənim üçün su tökün!” Biz onun dediyini yerinə yetirdik, sonra o yuyundu və ayağa qalxmaq istədikdə huşunu itirdi. Peyğəmbər ﷺ ayıldıqdan sonra (yenə) soruşdu: “Camaat namaz qılıbmı?” Biz dedik: “Xeyr, onlar səni gözləyirlər, ya Rəsulullah!” O (yenə) dedi: “Təknəyə mənim üçün su tökün!” O, (təknəyə) oturub yuyunduqdan sonra ayağa qalxmaq istədi, amma (yenə də) huşunu itirdi, ayıldıqdan sonra (yenə) soruşdu: “Camaat namaz qılıbmı?” Biz dedik: “Xeyr, onlar səni gözləyirlər, ya Rəsulullah!” O (yenə) dedi: “Təknəyə mənim üçün su tökün!” O, (təknəyə) oturub yuyunduqdan sonra ayağa qalxmaq istədi, amma (yenə də) huşunu itirdi, ayıldıqdan sonra (yenə) soruşdu: “Camaat namaz qılıbmı?” Biz dedik: “Xeyr, onlar səni gözləyirlər, ya Rəsulullah!” Bu əsnada camaat məsciddə oturub Peyğəmbəri ﷺ gözləyirdi ki, onlara axırıncı (namazı) – işa namazını qıldırsın. Peyğəmbər ﷺ Əbu Bəkrə xəbər göndərdi ki, camaata namaz qıldırsın. (Peyğəmbərin ﷺ) göndərdiyi adam onun yanına gəlib dedi: “Allahın elçisi ﷺ sənə əmr edir ki, camaata namaz qıldırasan.” Əbu Bəkr ürəyiyumşaq adam idi deyə belə dedi: “Ey Ömər, camaata namazı sən qıldır!” Ömər isə ona: “Sənin buna daha çox haqqın var”- deyə (etiraz etdi). Beləliklə, həmin günlərdə camaata namazı Əbu Bəkr qıldırdı. (Bir neçə gündən) sonra Peyğəmbərin ﷺ halı yaxşılaşdı və iki nəfər onun (sağından və solundan) qoluna girib zöhr namazını qılmaq üçün onu (məscidə) apardı. (Onun qoluna girən) iki nəfərdən biri Abbas idi. (Peyğəmbər ﷺ məscidə gəldikdə) Əbu Bəkr (camaata) namaz qıldırırdı. Əbu Bəkr onu görən kimi geriyə çəkilmək istədi, lakin Pey-

[1] Dərin taxta qab.

ğəmbər ﷺ əli ilə ona işarə etdi ki, geriyə çəkilmə. Peyğəmbər ﷺ (o iki nəfərə): "Məni onun yanında otuzdurun!"– dedi və onu Əbu Bəkrin yanında otuzdurdular. Bundan sonra Əbu Bəkr Peyğəmbərə ﷺ, camaat da Əbu Bəkrə tabe olaraq namaz qıldı. Peyğəmbər ﷺ (namazı) oturmuş vəziyyətdə qıldı. (əl-Buxari, 687)

٤١٠ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهَا قَالَتْ صَلَّى رَسُولُ اللَّهِ ﷺ فِى بَيْتِهِ وَهْوَ شَاكٍ، فَصَلَّى جَالِسًا وَصَلَّى وَرَاءَهُ قَوْمٌ قِيَامًا، فَأَشَارَ إِلَيْهِمْ أَنِ اجْلِسُوا، فَلَمَّا انْصَرَفَ قَالَ: «إِنَّمَا جُعِلَ الإِمَامُ لِيُؤْتَمَّ بِهِ، فَإِذَا رَكَعَ فَارْكَعُوا، وَإِذَا رَفَعَ فَارْفَعُوا، وَإِذَا صَلَّى جَالِسًا فَصَلُّوا جُلُوسًا». [رواه البخاري: ٦٨٨]

**410.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ xəstələndiyi zaman öz evində oturmuş vəziyyətdə namazı qıldı, arxasındakı camaat isə namazı ayaq üstə qıldı. O, onlara (əli ilə) işarə etdi ki, otursunlar. Namazı qılıb qurtardıqdan sonra buyurdu: "İmam ona görə təyin olunmuşdur ki, (arxasında) namaz qılanlar ona tabe olsunlar. O, rükuya gedəndə siz də rükuya gedin, o, (başını) qaldıranda, siz də (başınızı) qaldırın, o, oturmuş vəziyyətdə namaz qılarsa, siz də (namazı) oturmuş vəziyyətdə qılın." (əl-Buxari, 688)

## 35-ci fəsil. İmamın arxasında duranlar nə vaxt səcdə etməlidirlər?

## ٣٥– باب: مَتَى يَسْجُدُ مَنْ خَلْفَ الإِمَامِ

٤١١ – عَنْ الْبَرَاءِ رضي الله عنه قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا قَالَ: سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ لَمْ يَحْنِ أَحَدٌ مِنَّا ظَهْرَهُ حَتَّى يَقَعَ النَّبِيُّ ﷺ سَاجِدًا، ثُمَّ نَقَعُ سُجُودًا بَعْدَهُ. [رواه البخاري: ٦٩٠]

**411.** Bəra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ (namazda) "Səmi Allahu limən həmidəh[1]"– deyəndə, bizdən heç birimiz Peyğəmbər ﷺ səcdəyə gedənədək belini əyməzdi. O, səcdəyə qapıldıqdan sonra biz də səcdəyə gedərdik. (əl-Buxari, 690)

## 36-cı fəsil. İmamdan qabaq başını səcdədən qaldıranın günahı

## ٣٦– باب: إِثْمُ مَنْ رَفَعَ رَأْسَهُ قَبْلَ الإِمَامِ

٤١٢ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «أَمَا يَخْشَى أَحَدُكُمْ، أَوْ لاَ يَخْشَى أَحَدُكُمْ، إِذَا رَفَعَ رَأْسَهُ قَبْلَ الإِمَامِ أَنْ يَجْعَلَ اللَّهُ رَأْسَهُ رَأْسَ حِمَارٍ أَوْ يَجْعَلَ اللَّهُ صُورَتَهُ صُورَةَ حِمَارٍ». [رواه البخاري: ٦٩١]

**412.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məgər sizlərdən imamdan qabaq başını səcdədən qaldıranlar qorxmur ki, Allah onların başını eşşək başına döndərər və ya onların özlərini eşşəyə döndərər." (əl-Buxari, 691)

## 37-ci fəsil. Kölənin, köləlikdən azad olmuş adamın və ya həddi-buluğa çatmamış uşağın imamlıq etməsi

## ٣٧– باب: إِمَامَةُ الْعَبْدِ وَالْمَوْلَى وَالْغُلاَمِ الَّذِى لَمْ يَحْتَلِمْ

٤١٣ – عَنْ أَنَسٍ رضي الله عنه، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «اسْمَعُوا وَأَطِيعُوا، وَإِنِ اسْتُعْمِلَ حَبَشِيٌّ كَأَنَّ رَأْسَهُ زَبِيبَةٌ». [رواه البخاري: ٦٩٣]

[1] Allah Ona həmd edəni eşitdi.

**413.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üzərinizdə hökmranlıq edən kəs saçı kişmişə[1] bənzər həbəşi olsa belə, (əmrlərini) eşidib ona itaət edin." (əl-Buxari, 693)

**38-ci fəsil. Arxasındakılar** (namazı) **tam yerinə yetirdikləri halda imam səhvə yol verərsə**

**٣٨- باب: إِذَا لَمْ يُتِمَّ الإِمَامُ وَأَتَمَّ مَنْ خَلْفَهُ**

٤١٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «يُصَلُّونَ لَكُمْ، فَإِنْ أَصَابُوا فَلَكُمْ، وَإِنْ أَخْطَئُوا فَلَكُمْ وَعَلَيْهِمْ». [رواه البخاري: ٦٩٤]

**414.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İmamlar sizə namaz qıldırırlar. Əgər (namazı) düzgün qıldırarlarsa, sizə savab çatar və əgər səhvə yol verərlərsə, sizə (yenə də savab) çatar, (bunun günahı isə) onların öz əleyhinə olar." (əl-Buxari, 694)

**39-cu fəsil.** (Namazda) **adam imamın solunda durmaq istədikdə imam onu sağ tərəfinə keçirərsə, bu onların namazını batil etməz**

**٣٩- باب: إِذَا قَامَ الرَّجُلُ عَنْ يَسَارِ الإِمَامِ، فَحَوَّلَهُ الإِمَامُ إِلَى يَمِينِهِ لَمْ تَفْسُدْ صَلاَتُهُمَا**

٤١٥ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ، قَالَ نِمْتُ عِنْدَ مَيْمُونَةَ وَالنَّبِيُّ ﷺ عِنْدَهَا تِلْكَ اللَّيْلَةَ، فَتَوَضَّأَ ثُمَّ قَامَ يُصَلِّي، فَقُمْتُ عَلَى يَسَارِهِ، فَأَخَذَنِي فَجَعَلَنِي عَنْ يَمِينِهِ، فَصَلَّى ثَلاَثَ عَشْرَةَ رَكْعَةً، ثُمَّ نَامَ حَتَّى نَفَخَ – وَكَانَ إِذَا نَامَ نَفَخَ – ثُمَّ أَتَاهُ الْمُؤَذِّنُ، فَخَرَجَ فَصَلَّى وَلَمْ يَتَوَضَّأْ. [رواه البخاري: ٦٩٨]

**415.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "(Bir dəfə) mən (xalam) Meymunənin[2] evində gecələdim. O gecə Peyğəmbər ﷺ də onun yanında idi. Peyğəmbər ﷺ dəstəmaz alıb namaza durdu, mən də onun sol tərəfində durdum, lakin o məni tutub sağ tərəfinə keçirtdi və on üç rükət namaz qıldı. Sonra uzanıb yatdı, hətta, xoruldamağa başladı. O yatanda adətən xoruldayardı. (Səhər) müəzzin onun yanına gəldikdən sonra o, (evdən) çıxdı və dəstəmaz almadan namaz qıldı." (əl-Buxari, 698)

**40-cı fəsil. İmam** (namazı) **uzatdıqda, zəruri işləri olan bir adamın** (namazdan) **çıxıb onu təkbaşına qılması haqqında**

**٤٠- باب: إِذَا طَوَّلَ الإِمَامُ وَكَانَ لِلرَّجُلِ حَاجَةٌ فَخَرَجَ فَصَلَّى**

٤١٦ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ، قَالَ كَانَ مُعَاذُ بْنُ جَبَلٍ ﷺ يُصَلِّي مَعَ النَّبِيِّ ﷺ ثُمَّ يَرْجِعُ فَيَؤُمُّ قَوْمَهُ، فَصَلَّى الْعِشَاءَ فَقَرَأَ بِالْبَقَرَةِ، فَانْصَرَفَ الرَّجُلُ، فَكَأَنَّ مُعَاذًا تَنَاوَلَ مِنْهُ، فَبَلَغَ النَّبِيَّ ﷺ فَقَالَ: «فَتَّانٌ فَتَّانٌ فَتَّانٌ» ثَلاَثَ مِرَارٍ أَوْ قَالَ: «فَاتِنًا فَاتِنًا فَاتِنًا» وَأَمَرَهُ بِسُورَتَيْنِ مِنْ أَوْسَطِ الْمُفَصَّلِ. [رواه البخاري: ٧٠١]

[1] Həbəşilərin başı balaca və ya qara, yaxud da saçı qıvrım-qıvrım olduğundan Peyğəmbər ﷺ onu kişmişə bənzətmişdir.

[2] Meymunə ﷺ Peyğəmbərin ﷺ zövcələrindən biridir.

**416.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: "Muaz ibn Cəbəl Peyğəmbərlə ﷺ birlikdə namaz qılar, sonra da qayıdıb öz tayfasına namaz qıldırardı. (Bir dəfə) o, işa namazını qıldırarkən əl-Bəqərə surəsini oxudu. (Buna tab gətirə bilməyən) bir nəfər namazdan çıxdı. Deyəsən, Muaz onun barəsində xoşagəlməz sözlər söylədi. Bu hal-qəziyyə Peyğəmbərə ﷺ xəbər verildikdə, o üç dəfə: "Araqarışdıransanmı (ey Muaz?)"– dedi və ona müfəssəl surələr[1] arasından iki surə oxumağı əmr etdi. (əl-Buxari, 701)

## ٤١– باب: تَخْفِيفُ الإِمَامِ فِي الْقِيَامِ وَإِتْمَامِ الرُّكُوعِ وَالسُّجُودِ

## 41-ci fəsil. İmamın qiyamı[2] çox uzatmaması, rüku və səcdələri isə tam yerinə yetirməsi haqqında

٤١٧ – عَنْ أَبِي مَسْعُود ﵁، أَنَّ رَجُلاً قَالَ: وَاللَّه يَا رَسُولَ اللَّه إِنِّي لأَتَأَخَّرُ عَنْ صَلاَة الْغَدَاة منْ أَجْلِ فُلاَن ممَّا يُطيلُ بنَا، فَمَا رَأَيْتُ رَسُولَ اللَّه ﷺ في مَوْعظَة أَشَدَّ غَضَبًا مِنْهُ يَوْمَئِذ ثُمَّ قَالَ: «إِنَّ منْكُمْ مُنَفِّرِينَ، فَأَيُّكُمْ مَا صَلَّى بِالنَّاسِ فَلْيَتَجَوَّزْ، فَإِنَّ فِيهِمُ الضَّعِيفَ وَالْكَبِيرَ وَذَا الْحَاجَةِ». [رواه البخاري: ٧٠٢]

**417.** Əbu Məsud ﵁ rəvayət edir ki, bir nəfər Peyğəmbərə ﷺ dedi: "Ey Allahın Elçisi! Vallahi, mənim sübh namazına gəlməməyim ona görədir ki, filankəs bizə (onu) uzun-uzadı qıldırır."

(Əbu Məsud deyir ki,) "Mən Peyğəmbərin ﷺ öyüd-nəsihət verərkən o günkü qədər bərk qəzəbləndiyini görməmişdim. Sonra o dedi: "Həqiqətən, aranızda (dinə qarşı) nifrət oyadanlar vardır. Qoy aranızdan camaata namaz qıldıran kəs (bunu) xəfif etsin. Çünki onların arasında xəstələr, zəiflər və (təcili) işi çıxmış kimsələr ola bilər." (əl-Buxari, 702)

٤١٨ – وَ عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّه ﵄ حَديث مُعَاذ ﵁، أَنَّ النَّبِيَّ ﷺ قَالَ لَهُ: «فَلَوْلاَ صَلَّيْتَ بِسَبِّحِ اسْمَ رَبِّكَ، وَالشَّمْسِ وَضُحَاهَا، وَاللَّيْلِ إِذَا يَغْشَى» [رواه البخاري: ٧٠٥]

**418.** Cabir ibn Abdullah ﵄ Muaz ﵁ haqqında rəvayət etdiyi hədisə (əlavə edib) demişdir: Peyğəmbər ﷺ buyurdu: "Yaxşı olardı ki, namazda: "...Rəbbinin adına təriflər de![3]", "And olsun günəşə və onun saçdığı şəfəqə![4]" və "And olsun *yer üzünü zülmətə* bürüməkdə olan gecəyə![5]" surələrini oxuyaydın." (əl-Buxari, 705)

## ٤٢– باب: الإِيجَازُ فِي الصَّلاَةِ وَإِكْمَالِهَا

## 42-ci fəsil. Namazı uzatmadan tam yerinə yetirmək

٤١٩ – عَنْ أَنَسٍ ﵁ قَالَ: كَانَ النَّبِيُّ ﷺ يُوجِزُ الصَّلاَةَ وَيُكْمِلُهَا. [رواه البخاري: ٧٠٦]

**419.** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ (camaata qıldırdığı) namazı uzatmazdı, lakin onu tam yerinə yetirərdi. (əl-Buxari, 706)

---

[1] Quranın Qaf surəsindən ən-Nas surəsinədək olan surələrə müfəssəl deyilir.

[2] Burada qiyam deyildikdə namaz qılan adamın təkbir gətirib namaza başladıqdan ta rükuya gedənədək ayaq üstə olduğu hal nəzərdə tutulur.

[3] "əl-Əla" surəsi.

[4] "əş-Şəms" surəsi.

[5] "əl-Leyl" surəsi.

## 43-cü fəsil. Körpənin ağlamasını eşitdikdə namazı xəfif şəkildə qılan kimsə

## ٤٣– باب: مَنْ أَخَفَّ الصَّلَاةَ عِنْدَ بُكَاءِ الصَّبِي

٤٢٠ – عَنْ أَبِي قَتَادَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنِّي لأَقُومُ فِي الصَّلَاةِ أُرِيدُ أَنْ أُطَوِّلَ فِيهَا، فَأَسْمَعُ بُكَاءَ الصَّبِيِّ، فَأَتَجَوَّزُ فِي صَلَاتِي كَرَاهِيَةَ أَنْ أَشُقَّ عَلَى أُمِّهِ». [رواه البخاري: ٧٠٧]

**420.** Əbu Qətadə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən namaza duranda onu uzun-uzadı qılmaq istəyirəm, lakin körpənin ağlamasını eşidəndə onun anasına əziyyət verməyim deyə, namazımı qısaldıram." (əl-Buxari, 707)

## 44-cü fəsil. İqamə oxunduğu zaman və ondan sonra sıraların düzəldilməsi

## ٤٤– باب: تَسْوِيَةُ الصُّفُوفِ عِنْدَ الإِقَامَةِ وَبَعْدَهَا

٤٢١ – عَنْ النُّعْمَانِ بْنِ بَشِيرٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «لَتُسَوُّنَّ صُفُوفَكُمْ أَوْ لَيُخَالِفَنَّ اللَّهُ بَيْنَ وُجُوهِكُمْ». [رواه البخاري: ٧١٧]

**421.** Nomən ibn Bəşir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Namaza duranda) sıralarınızı düzəldin (və arada qalan boşluqları doldurun). Yoxsa Allah sizin üzünüzü dəyişdirər (aranıza ədavət salar)." (əl-Buxari, 717)

## 45-ci fəsil. Sıralar düzəldiyi zaman imamın camaata üz tutması

## ٤٥– باب: إِقْبَالُ الإِمَامِ عَلَى النَّاسِ عِنْدَ تَسْوِيَةِ الصُّفُوفِ

٤٢٢ – عَنْ أَنَسٍ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «أَقِيمُوا صُفُوفَكُمْ وَتَرَاصُّوا، فَإِنِّي أَرَاكُمْ مِنْ وَرَاءِ ظَهْرِي». [رواه البخاري: ٧١٩]

**422.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sıralarınızı düzəldin, özünüz də sıx durun. Həqiqətən, mən sizin arxamda (nə etdiyinizi) görürəm." (əl-Buxari, 719)

## 46-cı fəsil. İmamla camaatın arasında divarın və ya başqa bir maneənin olması

## ٤٦– باب: إِذَا كَانَ بَيْنَ الإِمَامِ وَبَيْنَ الْقَوْمِ حَائِطٌ أَوْ سُتْرَةٌ

٤٢٣ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُصَلِّي مِنَ اللَّيْلِ فِي حُجْرَتِهِ، وَجِدَارُ الْحُجْرَةِ قَصِيرٌ، فَرَأَى النَّاسُ شَخْصَ النَّبِيِّ ﷺ فَقَامَ أُنَاسٌ يُصَلُّونَ بِصَلَاتِهِ، فَأَصْبَحُوا فَتَحَدَّثُوا بِذَلِكَ، فَقَامَ لَيْلَةَ الثَّانِيَةِ، فَقَامَ مَعَهُ أُنَاسٌ يُصَلُّونَ بِصَلَاتِهِ، صَنَعُوا ذَلِكَ لَيْلَتَيْنِ أَوْ ثَلَاثَةً، حَتَّى إِذَا كَانَ بَعْدَ ذَلِكَ جَلَسَ رَسُولُ اللَّهِ ﷺ فَلَمْ يَخْرُجْ، فَلَمَّا أَصْبَحَ ذَكَرَ ذَلِكَ النَّاسُ فَقَالَ: «إِنِّي خَشِيتُ أَنْ تُكْتَبَ عَلَيْكُمْ صَلَاةُ اللَّيْلِ». [رواه البخاري: ٧٢٩]

**423.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ gecələr öz hücrəsində namaz qılardı. Hücrəsinin divarı alçaq olduğundan (bəzi) adamlar onun namaz qıldığını gördülər və ona qoşulub namaz qıldılar. Səhər açılanda isə bu haqda (camaata) danışmağa başladılar. Növbəti gecə o yenə namaza durdu və camaat da ona qoşulub namaz qılmağa başladı. Bu hal iki və ya üç gecə davam etdi. Nəhayət, yenə vaxt yetişdikdə o (evdə) oturub (namaza) çıxmadı. Səhər camaat ondan (bunun səbəbini) soruşduqda belə dedi: "Mən gecə namazının sizə vacib buyrulacağından qorxdum." (əl-Buxari, 729)

## 47-ci fəsil. Gecə namazı

## ٤٧– باب: صَلاَةُ اللَّيْلِ

٤٢٤ – عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ﵁، أَنَّ رَسُولَ اللَّهِ ﷺ اتَّخَذَ حُجْرَةً – قَالَ حَسِبْتُ أَنَّهُ قَالَ – مِنْ حَصِيرٍ فِى رَمَضَانَ فَصَلَّى فِيهَا لَيَالِىَ، فَصَلَّى بِصَلاَتِهِ نَاسٌ مِنْ أَصْحَابِهِ، فَلَمَّا عَلِمَ بِهِمْ جَعَلَ يَقْعُدُ، فَخَرَجَ إِلَيْهِمْ فَقَالَ: «قَدْ عَرَفْتُ الَّذِى رَأَيْتُ مِنْ صَنِيعِكُمْ، فَصَلُّوا أَيُّهَا النَّاسُ فِى بُيُوتِكُمْ، فَإِنَّ أَفْضَلَ الصَّلاَةِ صَلاَةُ الْمَرْءِ فِى بَيْتِهِ إِلاَّ الْمَكْتُوبَةَ». [رواه البخاري: ٧٣١]

**424.** Zeyd ibn Sabit ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ ramazan ayında özü üçün hücrə düzəltdi[1] və bir neçə gecə orada namaz qıldı. Əshabələrindən bir qismi ona qoşulub bu namazı qılmağa başladı. O, bunu biləndə (evində) oturub (namaza çıxmadı). Sonra onların yanına gəlib dedi: "Mən sizin nə etdiyinizi başa düşürəm. Ancaq ey insanlar, öz evlərinizdə namaz qılın. Çünki fərz namazlarından başqa ən fəzilətli namaz insanın öz evində qıldığı namazdır." (əl-Buxari, 731)

---

[1] Hədisi rəvayət edən ravi demişdir: "Deyəsən, o "...həsirdən"– dedi.

# كِتَابُ أَبْوَابِ صِفَةِ صَلاَةِ

# Namazın xüsusiyyətlərinə dair fəsillər

## ١– باب: رَفْعُ الْيَدَيْنِ فِى التَّكْبِيرَةِ الأُولَى مَعَ الافْتِتَاحِ سَوَاءً

## 1-ci fəsil. Namaza başlayanda "Allahu Əkbər" deyərkən əlləri qaldırmaq

٤٢٥ – عَنْ عَبْدِ اللَّهِ ابْنِ عُمَرَ رضي الله عنهما، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَرْفَعُ يَدَيْهِ حَذْوَ مَنْكِبَيْهِ إِذَا افْتَتَحَ الصَّلاَةَ، وَإِذَا كَبَّرَ لِلرُّكُوعِ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ رَفَعَهُمَا كَذَلِكَ أَيْضًا، وَقَالَ: «سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ، رَبَّنَا وَلَكَ الْحَمْدُ». وَكَانَ لاَ يَفْعَلُ ذَلِكَ فِى السُّجُودِ. [رواه البخاري: ٧٣٥]

**425.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ namaza başlayanda əllərini çiyinləri bərabərinə qaldırardı. Həmçinin, "Allahu Əkbər" deyib, rükuya gedəndə və rükudan başını qaldıranda da əllərini qaldırardı, (rükudan qalxarkən) "Səmi Allahu limən həmidəh, Rabbənə və ləkəl-həmd!"[1] deyərdi. Səcdəyə gedəndə isə (əllərini) qaldırmazdı. (əl-Buxari, 735)

## ٢– باب: وَضْعُ الْيُمْنَى عَلَى الْيُسْرَى

## 2-ci fəsil. Sağ əli sol əlin üstünə qoymaq

٤٢٦ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ رضي الله عنه قَالَ: كَانَ النَّاسُ يُؤْمَرُونَ أَنْ يَضَعَ الرَّجُلُ الْيَدَ الْيُمْنَى عَلَى ذِرَاعِهِ الْيُسْرَى فِى الصَّلاَةِ. [رواه البخاري: ٧٤٠]

**426.** Rəvayət edilir ki, Səhl ibn Səd رضي الله عنه demişdir: "Camaata əmr edilərdi ki, namaz qıldıqda sağ əli sol qolun üstünə qoysunlar." (əl-Buxari, 740)

## ٣– باب: مَا يَقُولُ بَعْدَ التَّكْبِيرِ

## 3-cü fəsil. "Allahu Əkbər" sözündən sonra nə deyilməlidir

٤٢٧ – عَنْ أَنَسٍ رضي الله عنه، أَنَّ النَّبِيَّ ﷺ وَأَبَا بَكْرٍ وَعُمَرَ رضي الله عنهما كَانُوا يَفْتَتِحُونَ الصَّلاَةَ بِـ «الْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ» [رواه البخاري: ٧٤٣]

**427.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ, Əbu Bəkr və Ömər رضي الله عنهما namazı "Əlhəmdulillahi Rabbil aləmin"[2] kəlməsi ilə başlayardılar. (əl-Buxari, 743)

٤٢٨ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَسْكُتُ بَيْنَ التَّكْبِيرِ وَبَيْنَ الْقِرَاءَةِ إِسْكَاتَةً – قَالَ أَحْسِبُهُ قَالَ هُنَيَّةً – فَقُلْتُ بِأَبِى وَأُمِّى يَا رَسُولَ اللَّهِ، إِسْكَاتُكَ بَيْنَ التَّكْبِيرِ وَالْقِرَاءَةِ مَا تَقُولُ؟ قَالَ: «أَقُولُ اللَّهُمَّ بَاعِدْ بَيْنِى وَبَيْنَ

---

[1] Tərcüməsi: Allah Ona həmd edəni eşitdi! Ey Rəbbimiz, Sənə həmd olsun!
[2] Tərcüməsi: Həmd olsun aləmlərin Rəbbi Allaha!

خَطَايَايَ كَمَا بَاعَدْتَ بَيْنَ الْمَشْرِقِ وَالْمَغْرِبِ، اللَّهُمَّ نَقِّنِي مِنَ الْخَطَايَا كَمَا يُنَقَّى الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ، اللَّهُمَّ اغْسِلْ خَطَايَايَ بِالْمَاءِ وَالثَّلْجِ وَالْبَرَدِ». [رواه البخاري: ٧٤٤]

**428.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbər ﷺ: "Allahu Əkbər" deyib (namaza başladıqdan sonra "əl-Fatihə" surəsini) oxuyanadək bir qədər susardı. Mən dedim: "Ata-anam sənə fəda olsun, ya Rəsulullah! Sən təkbir gətirdikdən sonra (surəni) oxuyanadək susduğun zaman nə deyirsən?" O dedi: "Mən (sakit duranda bu duanı) oxuyuram: "Allahummə baid bəyni və bəynə xatayayə kəmə bəadtə bəynəl-məşriqi vəl-məğrib, Allahummə nəqqini minəl-xataya kəmə yunəqqəs-sovbul-əbyədu minəd-dənəs, Allahumməğsil xətayayə bil-mai, vəs-səlci, vəl-bərədi."[1] (əl-Buxari, 744)

## 4-cü fəsil

## ٤ – باب

**٤٢٩** – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ﵄، أَنَّ النَّبِيَّ ﷺ صَلَّى صَلاَةَ الْكُسُوفِ، فَقَامَ فَأَطَالَ الْقِيَامَ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ،

**٤٣٠** – ثُمَّ قَامَ فَأَطَالَ الْقِيَامَ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ثُمَّ رَفَعَ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ، ثُمَّ رَفَعَ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ، ثُمَّ قَامَ فَأَطَالَ الْقِيَامَ ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ثُمَّ رَفَعَ فَأَطَالَ الْقِيَامَ ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ثُمَّ رَفَعَ فَسَجَدَ فَأَطَالَ السُّجُودَ، ثُمَّ رَفَعَ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ ثُمَّ انْصَرَفَ فَقَالَ: «قَدْ دَنَتْ مِنِّي الْجَنَّةُ حَتَّى لَوِ اجْتَرَأْتُ عَلَيْهَا لَجِئْتُكُمْ بِقِطَافٍ مِنْ قِطَافِهَا، وَدَنَتْ مِنِّي النَّارُ حَتَّى قُلْتُ أَيْ رَبِّ وَأَنَا مَعَهُمْ فَإِذَا امْرَأَةٌ – حَسِبْتُ أَنَّهُ قَالَ – تَخْدِشُهَا هِرَّةٌ، قُلْتُ مَا شَأْنُ هَذِهِ قَالُوا حَبَسَتْهَا حَتَّى مَاتَتْ جُوعًا، لاَ أَطْعَمَتْهَا، وَلاَ أَرْسَلَتْهَا تَأْكُلُ». قَالَ حَسِبْتُ أَنَّهُ قَالَ: «مِنْ خَشِيشٍ أَوْ خُشَاشِ الأَرْضِ». [رواه البخاري: ٧٤٥]

**429.** Əsma bint Əbu Bəkr ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ (günəş tutulduğu zaman)
**430.** kusuf[2] namazına durdu və qiyamı[3] uzatdı, sonra rükuya getdi və rükunu uzatdı, sonra rükudan qalxdı və (yenə) qiyamı uzatdı, sonra (bir də) rükuya getdi və rükunu uzatdı, sonra rükudan qalxdı, sonra səcdəyə getdi və səcdəni uzatdı, sonra qalxıb oturdu, sonra səcdəyə getdi və səcdəni uzatdı, sonra namaza durdu və qiyamı uzatdı, sonra rükuya getdi və rükunu uzatdı, sonra rükudan qalxdı və (yenə) qiyamı uzatdı, sonra (bir də) rükuya getdi və rükunu uzatdı, sonra rükudan qalxdı, sonra səcdəyə getdi və səcdəni uzatdı, sonra qalxıb oturdu, sonra (yenə) səcdəyə getdi və səcdəni uzatdı, sonra (namazı) bitirdi və dedi: "Cənnət mənə o qədər yaxınlaşdı ki, əgər ona (əl uzatmağa) cəsarətim olsaydı, oradakı salxımlardan birini sizə gətirərdim. Habelə, Cəhənnəm də mənə o qədər yaxınlaşdı ki, axırda mən dedim: "Ey Rəbbim, yoxsa məni də onlarla bir yerə salacaqsan?" Birdən mən bir qadın gördüm[4] və soruşdum ki: "Bu qadının günahı nədir?" (Mənə) dedilər: "Bu qadın (pişiyi) acından ölənədək (evdə) saxlamış, nə ona yemək vermiş, nə də onu sərbəst buraxmışdır ki, gedib özünə yem tapsın"[5]. (əl-Buxari, 745)

---

[1] Tərcüməsi: Allahım, məğriblə məşriqin arasını uzaqlaşdırdığın kimi məni də günahlarımdan uzaqlaşdır! Allahım, ağ paltar kirdən təmizləndiyi kimi məni də günahlardan təmizlə! Allahım, mənim günahlarımı su, qar və dolu ilə yu!

[2] Günəş və ya ay tutularkən qılınan namazın adıdır.

[3] Burada Peyğəmbərin ﷺ təkbir gətirdikdən rükuya gedənədək ayaq üstə olduğu hal nəzərdə tutulur.

[4] Hədisin ravisi: "Deyəsən o: "Bir pişik həmin qadını cırmaqlayırdı"– demişdir.

[5] Hədisin ravisi: "Deyəsən o: "...yerdəki həşəratlardan yesin"– demişdir.

## 5-ci fəsil. Namaz əsnasında imama nəzər salmaq

## ٥- باب: رَفْعُ الْبَصَرِ إِلَى الإِمَامِ فِى الصَّلاَةِ

٤٣١ – عَنْ خَبَّابٍ ﷺ، قِيلَ لَهُ: أَكَانَ رَسُولُ اللَّهِ ﷺ يَقْرَأُ فِى الظُّهْرِ وَالْعَصْرِ؟ قَالَ نَعَمْ. قُلْنَا بِمَ كُنْتُمْ تَعْرِفُونَ ذَاكَ قَالَ بِاضْطِرَابِ لِحْيَتِهِ. [رواه البخاري: ٧٤٦]

**431.** Rəvayət edilir ki, Xəbbabdan ﷺ soruşdular: "Peyğəmbər ﷺ zöhr və əsr namazlarında (Quran) oxuyardımı?" O: "Bəli!"– deyə cavab verdi. Biz soruşduq: "Siz bunu nədən bilirdiniz?" O dedi: "Saqqalının tərpənməsindən." (əl-Buxari, 746)

## 6-cı fəsil. Namaz əsnasında göyə baxmaq

## ٦- باب: رَفْعُ الْبَصَرِ إِلَى السَّمَاءِ فِى الصَّلاَةِ

٤٣٢ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «مَا بَالُ أَقْوَامٍ يَرْفَعُونَ أَبْصَارَهُمْ إِلَى السَّمَاءِ فِى صَلاَتِهِمْ». فَاشْتَدَّ قَوْلُهُ فِى ذَلِكَ حَتَّى قَالَ: «لَيَنْتَهُنَّ عَنْ ذَلِكَ أَوْ لَتُخْطَفَنَّ أَبْصَارُهُمْ». [رواه البخاري: ٧٥٠]

**432.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurdu: "Namaz əsnasında göyə baxan adamlara nə olub ki, (belə edirlər)?" O, buna çox sərt münasibət bildirdikdən sonra dedi: "Ya buna son qoyacaqlar, ya da ki gözləri kor olacaq." (əl-Buxari, 750)

## 7-ci fəsil. Namaz əsnasında o tərəf-bu tərəfə baxmaq

## ٧- باب: الالْتِفَاتُ فِى الصَّلاَةِ

٤٣٣ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ عَنْ الالْتِفَاتِ فِى الصَّلاَةِ فَقَالَ: «هُوَ اخْتِلاَسٌ يَخْتَلِسُهُ الشَّيْطَانُ مِنْ صَلاَةِ الْعَبْدِ». [رواه البخاري: ٧٥١]

**433.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən Peyğəmbərdən ﷺ namazda o tərəf-bu tərəfə baxmaq barədə soruşdum. O dedi: "Bu, şeytanın (Allah) bəndəsinin namazından xəlvətcə götürüb apardığı oğurluq bir şeydir." (əl-Buxari, 751)

## 8-ci fəsil. Bütün namazlarda imamın və onun arxasında duranların (Qurandan) oxuması vacibdir

## ٨- باب: وُجُوبُ الْقِرَاءَةِ للإِمَامِ وَالْمَأْمُومِ فِى الصَّلَوَاتِ كُلِّهَا

٤٣٤ – عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ﷺ قَالَ: شَكَا أَهْلُ الْكُوفَةِ سَعْدًا إِلَى عُمَرَ رضى الله عنه فَعَزَلَهُ وَاسْتَعْمَلَ عَلَيْهِمْ عَمَّارًا، فَشَكَوْا حَتَّى ذَكَرُوا أَنَّهُ لاَ يُحْسِنُ يُصَلِّى، فَأَرْسَلَ إِلَيْهِ فَقَالَ يَا أَبَا إِسْحَاقَ إِنَّ هَؤُلاَءِ يَزْعُمُونَ أَنَّكَ لاَ تُحْسِنُ تُصَلِّى قَالَ أَبُو إِسْحَاقَ أَمَّا أَنَا وَاللَّهِ فَإِنِّى كُنْتُ أُصَلِّى بِهِمْ صَلاَةَ رَسُولِ اللَّهِ ﷺ مَا أَخْرِمُ عَنْهَا، أُصَلِّى صَلاَةَ

الْعِشَاءِ فَأَرْكُدُ فِى الأُولَيَيْنِ وَأُخِفُّ فِى الأُخْرَيَيْنِ. قَالَ ذَاكَ الظَّنُّ بِكَ يَا أَبَا إِسْحَاقَ. فَأَرْسَلَ مَعَهُ رَجُلاً أَوْ رِجَالاً إِلَى الْكُوفَةِ، فَسَأَلَ عَنْهُ أَهْلَ الْكُوفَةِ، وَلَمْ يَدَعْ مَسْجِدًا إِلاَّ سَأَلَ عَنْهُ، وَيُثْنُونَ مَعْرُوفًا، حَتَّى دَخَلَ مَسْجِدًا لِبَنِى عَبْسٍ، فَقَامَ رَجُلٌ مِنْهُمْ يُقَالُ لَهُ أُسَامَةُ بْنُ قَتَادَةَ يُكْنَى أَبَا سَعْدَةَ قَالَ أَمَّا إِذْ نَشَدْتَنَا فَإِنَّ سَعْدًا كَانَ لاَ يَسِيرُ بِالسَّرِيَّةِ، وَلاَ يَقْسِمُ بِالسَّوِيَّةِ، وَلاَ يَعْدِلُ فِى الْقَضِيَّةِ. قَالَ سَعْدٌ أَمَا وَاللَّهِ لأَدْعُوَنَّ بِثَلاَثٍ، اللَّهُمَّ إِنْ كَانَ عَبْدُكَ هَذَا كَاذِبًا، قَامَ رِيَاءً وَسُمْعَةً فَأَطِلْ عُمْرَهُ، وَأَطِلْ فَقْرَهُ، وَعَرِّضْهُ بِالْفِتَنِ، وَكَانَ بَعْدُ إِذَا سُئِلَ يَقُولُ شَيْخٌ كَبِيرٌ مَفْتُونٌ، أَصَابَتْنِى دَعْوَةُ سَعْدٍ. قَالَ عَبْدُ الْمَلِكِ فَأَنَا رَأَيْتُهُ بَعْدُ قَدْ سَقَطَ حَاجِبَاهُ عَلَى عَيْنَيْهِ مِنَ الْكِبَرِ، وَإِنَّهُ لَيَتَعَرَّضُ لِلْجَوَارِى فِى الطُّرُقِ يَغْمِزُهُنَّ. [رواه البخاري: ٧٥٥]

**434.** Cabir ibn Səmura ﷺ belə rəvayət etmişdir ki, kufəlilər Ömərə Səd ibn Əbu Vəqqasdan şikayət etdilər. Buna görə də Ömər onu (bu vəzifədən) kənarlaşdırdı və yerinə Əmmar ibn Yasiri hakim təyin etdi. Kufəlilər (çox) şikayət etdilər, hətta (Sədin) namazı lazımı qaydada qılmadığını belə iddia etdilər. Belə olduqda, Ömər adam göndərib onu yanına çağırtdırdı və dedi: "Ey Əbu İshaq! Bunlar iddia edirlər ki, sən namazı lazımı qaydada qılmırsan." Əbu İshaq dedi: "Mənə gəlincə, vallahi ki, mən onlara Peyğəmbərin ﷺ namazını qıldırmışam və bundan (heç bir şey) əskiltməmişəm. İşa namazını qıldıranda ilk iki rükəti uzun, son iki rükəti isə qısa qıldırmışam." Ömər: "Mən elə belə də bilirdim, ey Əbu İshaq!"– dedi, sonra da onunla birlikdə Kufəyə bir və ya iki adam göndərdi ki, gedib kufəlilərdən onun barəsində soruşsunlar. (Kufədə) elə bir məscid qalmadı ki, (göndərilən adam) onun barəsində soruşmasın. Hamı onu təriflədi. Axırda həmin adam Abs oğullarının məscidinə gəldi. Oradakılardan Əbu Sədə ləqəbi ilə tanınan Usamə ibn Qətadə adlı birisi ayağa qalxıb dedi: "Madam ki, and verib bizdən soruşdun, (onda bil ki,) Səd (heç vaxt) döyüşə gedən dəstəyə qoşulmayıb, (qənimətləri) düzgün bölüşdürməyib və şəriət məsələlərində ədalətlə hökm verməyib." Səd dedi: "İndi ki belə oldu, onda vallahi ki, mən də üç şeylə bağlı (Allaha) dua edəcəyəm: "Allahım! Əgər sənin bu qulun yalançıdırsa, üstəlik bunu özünü göstərmək və ad qazanmaq məqsədi ilə edirsə, onda onun ömrünü uzat, yoxsulluğunu artır və onu bəlalara düçar et!" (Uca Allah Sədin duasını qəbul etdi). Sonralar həmin adamdan (onun halı barədə) soruşanda deyərdi: "Mən başıbəlalı bir qocayam, məni Sədin bədduası tutub."

Abdul-Malik ﷺ demişdir: "Sonralar mən o adamı gördüm, qocalığından qaşları gözlərinin üstünə düşmüşdü, özü də küçələrdə cariyələrə[1] əl atırdı." (əl-Buxari, 755)

**٤٣٥** – عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ صَلاَةَ لِمَنْ لَمْ يَقْرَأْ بِفَاتِحَةِ الْكِتَابِ». [رواه البخاري: ٧٥٦]

**435.** Ubadə ibn Samit ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "əl-Fatihəni oxumayanın namazı qəbul deyildir!" (əl-Buxari, 756)

**٤٣٦** – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ دَخَلَ الْمَسْجِدَ، فَدَخَلَ رَجُلٌ فَصَلَّى فَسَلَّمَ عَلَى النَّبِيِّ ﷺ فَرَدَّ وَقَالَ: «ارْجِعْ فَصَلِّ، فَإِنَّكَ لَمْ تُصَلِّ» فَرَجَعَ يُصَلِّى كَمَا صَلَّى ثُمَّ جَاءَ فَسَلَّمَ عَلَى النَّبِيِّ ﷺ فَقَالَ: «ارْجِعْ فَصَلِّ فَإِنَّكَ لَمْ تُصَلِّ» ثَلاَثًا، فَقَالَ وَالَّذِى بَعَثَكَ بِالْحَقِّ مَا أُحْسِنُ غَيْرَهُ فَعَلِّمْنِى، فَقَالَ: «إِذَا قُمْتَ إِلَى الصَّلاَةِ فَكَبِّرْ، ثُمَّ اقْرَأْ

[1] 243-cü hədisin qeydlərinə bax.

مَا تَيَسَّرَ مَعَكَ مِنَ الْقُرْآنِ، ثُمَّ ارْكَعْ حَتَّى تَطْمَئِنَّ رَاكِعًا، ثُمَّ ارْفَعْ حَتَّى تَعْتَدِلَ قَائِمًا، ثُمَّ اسْجُدْ حَتَّى تَطْمَئِنَّ سَاجِدًا، ثُمَّ ارْفَعْ حَتَّى تَطْمَئِنَّ جَالِسًا، وَافْعَلْ ذَلِكَ فِى صَلاَتِكَ كُلِّهَا». [رواه البخاري: ٧٥٧]

**436.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ məscidə daxil oldu, (arxasınca) da bir nəfər (ora) daxil olub namaz qıldı və (namazı bitirdikdən) sonra Peyğəmbərə ﷺ salam verdi. Peyğəmbər ﷺ onun salamını aldı və buyurdu: "Qayıt namazını qıl, çünki sən namaz qılmadın." O, əvvəlki kimi namaz qıldı, sonra da Peyğəmbərin ﷺ yanına gəlib ona salam verdi. Peyğəmbər ﷺ (yenə ona) buyurdu: "Qayıt namazını qıl, çünki sən namaz qılmadın." Bu hal üç dəfə təkrar oldu. Sonra o adam dedi: "Səni haqq (din) ilə göndərənə and olsun ki, mən bundan daha düzgün olanını qıla bilmirəm. Mənə (nə edəcəyimi) öyrət!" O buyurdu: "Namaza duranda "Allahu Əkbər" de, sonra Qurandan sənə asan gələni oxu, sonra rükuya get (və bunu) rahat-rahat[1] yerinə yetir, sonra (başını) qaldırıb qamətini dümdüz tut, sonra səcdəyə get (və bunu) rahatlıqla[2] yerinə yetir, sonra qalx otur (və) tam rahat ol və namazının qalan rükətlərində də belə et." (əl-Buxari, 757)

## 9-cu fəsil. Zöhr namazında (Quran) oxumaq

## ٩- باب: الْقِرَاءَةُ فِى الظُّهْرِ

٤٣٧ – عَنْ أَبِى قَتَادَةَ ﷺ قَالَ: كَانَ النَّبِىُّ ﷺ يَقْرَأُ فِى الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ مِنْ صَلاَةِ الظُّهْرِ بِفَاتِحَةِ الْكِتَابِ وَسُورَتَيْنِ، يُطَوِّلُ فِى الأُولَى، وَيُقَصِّرُ فِى الثَّانِيَةِ، وَيُسْمِعُ الآيَةَ أَحْيَانًا، وَكَانَ يَقْرَأُ فِى الْعَصْرِ بِفَاتِحَةِ الْكِتَابِ وَسُورَتَيْنِ، وَكَانَ يُطَوِّلُ فِى الأُولَى، وَكَانَ يُطَوِّلُ فِى الرَّكْعَةِ الأُولَى مِنْ صَلاَةِ الصُّبْحِ، وَيُقَصِّرُ فِى الثَّانِيَةِ. [رواه البخاري: ٧٥٩]

**437.** Əbu Qətadə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ zöhr namazının ilk iki rükətində əl-Fatihə surəsini və (hər rükətdə) bir surə oxuyar, birinci rükəti uzadar, ikincisini isə qısa qılardı, hərdən ayələri (bizə) eşitdirərdi, əsr namazında da əl-Fatihə surəsini və iki surə oxuyar, birinci rükəti uzadar, (ikincisini isə qısa qılardı), həmçinin sübh namazının birinci rükətini uzadar, ikincisini isə qısa qılardı. (əl-Buxari, 759)

## 10-cu fəsil. Məğrib namazında (Quran) oxumaq

## ١٠- باب: الْقِرَاءَةُ فِى الْمَغْرِبِ

٤٣٨ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: إِنَّ أُمَّ الْفَضْلِ سَمِعَتْهُ وَهُوَ يَقْرَأُ ﴿وَٱلْمُرْسَلَٰتِ عُرْفًا﴾ فَقَالَتْ يَا بُنَىَّ وَاللَّهِ لَقَدْ ذَكَّرْتَنِى بِقِرَاءَتِكَ هَذِهِ السُّورَةَ، إِنَّهَا لآخِرُ مَا سَمِعْتُ مِنْ رَسُولِ اللَّهِ ﷺ يَقْرَأُ بِهَا فِى الْمَغْرِبِ. [رواه البخاري: ٧٦٣]

**438.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Ummu Fədl[3] onun "And olsun xeyirlə göndərilənlərə"[4] surəsini oxuduğunu eşidəndə ona demişdir: "Oğlum! Vallahi, sən bu surəni oxumaqla mənə (unutduğum bir şeyi) xatırlatdın. Mən bu surəni

[1] Digər rəvayətdə: "...rükuya getdikdə əllərini dizinə qoy, sərbəst ol və belini düz saxla..."
[2] Digər rəvayətdə: "...sərbəst ol və belini düz saxla..."
[3] Ummu Fədl رضي الله عنها ibn Abbasın رضي الله عنهما anasıdır.
[4] "əl-Mursəlat" surəsi.

axırıncı dəfə Peyğəmbər ﷺ onu məğrib namazında oxuyarkən eşitmişəm". (əl-Buxari, 763)

٤٣٩ – عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقْرَأُ بِطُولِ الطُّولَيَيْنِ. [رواه البخاري: ٧٦٤]

**439.** Rəvayət edilir ki, Zeyd ibn Sabit ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ məğrib namazında iki uzun surədən ən uzununu[1] oxuduğunu eşitmişəm." (əl-Buxari, 764)

## 11-ci fəsil. Məğrib namazını səslə oxumaq

## ١١– باب: الْجَهْرُ فِي الْمَغْرِبِ

٤٤٠ – عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ قَرَأَ فِي الْمَغْرِبِ بِالطُّورِ. [رواه البخاري: ٧٦٥]

**440.** Rəvayət edilir ki, Cubeyr ibn Mutim ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ məğrib namazında ət-Tur surəsini oxuduğunu eşitmişəm." (əl-Buxari, 765)

## 12-ci fəsil. İşa namazında (Quran) oxuyub səcdəyə getmək

## ١٢– باب: الْقِرَاءَةُ فِي الْعِشَاءِ بِالسَّجْدَةِ

٤٤١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: صَلَّيْتُ خَلْفَ أَبِي الْقَاسِمِ ﷺ الْعَتَمَةَ فَقَرَأَ «إِذَا السَّمَاءُ انْشَقَّت» فَسَجَدَ، فَلاَ أَزَالُ أَسْجُدُ بِهَا حَتَّى أَلْقَاهُ. [رواه البخاري: ٧٦٨]

**441.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Əbul-Qasımın ﷺ arxasında namaz qıldım, o "Göy yarılacağı" surəsini oxuyub səcdəyə getdi[2]. Mən də ona qovuşanadək (hər dəfə) bu surəni oxuduqda səcdə edəcəyəm." (əl-Buxari, 768)

## 13-cü fəsil. İşa namazında (Quran) oxumaq

## ١٣– باب: الْقِرَاءَةُ فِي الْعِشَاءِ

٤٤٢ – عَنْ الْبَرَاءِ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ كَانَ فِي سَفَرٍ، فَقَرَأَ فِي العِشَاءِ فِي إِحْدَى الرَّكْعَتَيْنِ، بِـ ﴿وَٱلتِّينِ وَٱلزَّيْتُونِ﴾، وَمَا سَمِعْتُ أَحَدًا أَحْسَنَ صَوْتًا مِنْهُ أَوْ قِرَاءَةً. [رواه البخاري: ٧٦٩]

**442.** Bəra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ səfərdə ikən (qıldığı) işa namazının rükətlərindən birində: "And olsun əncirə və zeytuna!"[3] surəsini oxudu.

Mən onun səsindən və ya qiraətindən daha gözəlini eşitməmişdim. (əl-Buxari, 769)

---

[1] Burada ən uzun surə deyildikdə, "əl-Əraf" surəsi nəzərdə tutulur. Hədisin başqa variantında rəvayət edilir ki, Zeyd ibn Sabit Mərvan ibn Həkəmin məğrib namazında qısa surələr oxuduğunu eşidib demişdir: "Nə üçün sən məğrib namazında qısa müfəssəl surələrdən oxuyursan? Mən Peyğəmbərin ﷺ məğrib namazında iki uzun surədən ən uzununu oxuduğunu eşitmişəm."

(Hədisin ravisi) ibn Əbu Muleykə ﷺ Urva ibn Zubeyrdən ﷺ: "İki uzun surədən ən uzunu nədir?" soruşduqda o: "əl-Əraf, o birisi də əl-Ənam..." demişdir. (Səhih Sunən Əbu Davud, 812)

[2] Burada "əl-İnşiqaq" surəsi və bu surənin 21-ci ayəsi nəzərdə tutulur.

[3] Yəni "ət-Tin" surəsi.

## 14-cü fəsil. Sübh namazında (Quran) oxumaq

## ١٤– باب: الْقِرَاءَةُ فِي الْفَجْرِ

٤٤٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: فِي كُلِّ صَلاَةٍ يُقْرَأُ، فَمَا أَسْمَعَنَا رَسُولُ اللَّهِ ﷺ أَسْمَعْنَاكُمْ، وَمَا أَخْفَى عَنَّا أَخْفَيْنَا عَنْكُمْ، وَإِنْ لَمْ تَزِدْ عَلَى أُمِّ الْقُرْآنِ أَجْزَأَتْ، وَإِنْ زِدْتَ فَهُوَ خَيْرٌ. [رواه البخاري: ٧٧٢]

**443.** Rəvayət edir ki, Əbu Hureyra ﷺ demişdir: "Hər namazda (Quran) oxumaq lazımdır. Peyğəmbər ﷺ (namazda Quran oxuduqda) nəyi bizə səslə oxumuşdursa, biz də onu sizə səslə oxuyuruq və nəyi bizə səssiz oxumuşdursa, biz də onu sizə səssiz oxuyuruq. (Namazda) ancaq "əl-Fatihə" surəsini oxusan, bu kifayət edər, əgər əlavə etsən, bu daha yaxşı olar." (əl-Buxari, 772)

## 15-ci fəsil. Sübh namazında (Quranı) səslə oxumaq

## ١٥– باب: الْجَهْرُ بِقِرَاءَةِ صَلاَةِ الْفَجْرِ

٤٤٤ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: انْطَلَقَ النَّبِيُّ ﷺ فِي طَائِفَةٍ مِنْ أَصْحَابِهِ عَامِدِينَ إِلَى سُوقِ عُكَاظ، وَقَدْ حِيلَ بَيْنَ الشَّيَاطِينِ وَبَيْنَ خَبَرِ السَّمَاءِ، وَأُرْسِلَتْ عَلَيْهِمُ الشُّهُبُ، فَرَجَعَتِ الشَّيَاطِينُ إِلَى قَوْمِهِمْ، فَقَالُوا: مَا لَكُمْ فَقَالُوا حِيلَ بَيْنَنَا وَبَيْنَ خَبَرِ السَّمَاءِ، وَأُرْسِلَتْ عَلَيْنَا الشُّهُبُ. قَالُوا: مَا حَالَ بَيْنَكُمْ وَبَيْنَ خَبَرِ السَّمَاءِ إِلاَّ شَيْءٌ حَدَثَ، فَاضْرِبُوا مَشَارِقَ الأَرْضِ وَمَغَارِبَهَا، فَانْظُرُوا مَا هَذَا الَّذِي حَالَ بَيْنَكُمْ وَبَيْنَ خَبَرِ السَّمَاءِ فَانْصَرَفَ أُولَئِكَ الَّذِينَ تَوَجَّهُوا نَحْوَ تِهَامَةَ إِلَى النَّبِيِّ ﷺ وَهُوَ بِنَخْلَةَ، عَامِدِينَ إِلَى سُوقِ عُكَاظ وَهُوَ يُصَلِّي بِأَصْحَابِهِ صَلاَةَ الْفَجْرِ، فَلَمَّا سَمِعُوا الْقُرْآنَ اسْتَمَعُوا لَهُ فَقَالُوا هَذَا وَاللَّهِ الَّذِي حَالَ بَيْنَكُمْ وَبَيْنَ خَبَرِ السَّمَاءِ. فَهُنَالِكَ حِينَ رَجَعُوا إِلَى قَوْمِهِمْ وَقَالُوا: يَا قَوْمَنَا: ﴿إِنَّا سَمِعْنَا قُرْءَانًا عَجَبًا يَهْدِىٓ إِلَى ٱلرُّشْدِ فَـَٔامَنَّا بِهِۦ وَلَن نُّشْرِكَ بِرَبِّنَآ أَحَدًا﴾ فَأَنْزَلَ اللَّهُ عَلَى نَبِيِّهِ ﷺ: ﴿قُلْ أُوحِىَ إِلَىَّ﴾ وَإِنَّمَا أُوحِيَ إِلَيْهِ قَوْلُ الْجِنِّ. [رواه البخاري: ٧٧٣]

**444.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir dəstə əshabəsi ilə Ukaz bazarına getdi. Artıq şeytanlar səmavi xəbəri (Allahın mələklərə nazil etdiyi vəhyi) oğrun-oğrun öyrənməkdən məhrum olmuş və onları yandırıb yaxan ulduzlar təqib etmişdir. Onlar öz qövmünün yanına qayıtdıqda (onlardan): "Sizə nə olub?"– deyə soruşdular və onlar dedilər: "Biz səmavi xəbəri öyrənməkdən məhrum olduq və üstümüzə yanar ulduzlar endirildi!" Onlara dedilər: "Sizi səmavi xəbəri öyrənməkdən məhrum edən şey, baş vermiş yeni hadisədir! Gedin, yer üzünü məşriqdən məğribə kimi gəzin və baxın görün sizi səmavi xəbəri öyrənməkdən məhrum edən nədir!" Onlardan bir dəstə Tihaməyə[1] tərəf getdi və Nəxlədə[2] Ukaz[3] bazarına yollanan Peyğəmbərə ﷺ rast gəldi. O, əshabələri ilə birlikdə sübh namazını qılırdı. Cinlər Quranı eşitdikdə (dayanıb) qulaq asdılar və dedilər: "Vallahi, bizi səmavi xəbərdən məhrum edən budur." Sonra onlar öz qövmünün yanına qayıdıb dedilər: "Ey qövmümüz! Biz çox qəribə bir Quran eşitdik. O, haqq yolu göstərir. Biz ona iman gətirdik və bir daha heç kəsi Rəbbimizə şərik qoşmayacağıq." Uca Allah da Peyğəmbərinə ﷺ: "De: – Mənə vəhy olundu ki,.."[4] surəsini nazil etdi. Beləliklə də, cinlərin dedikləri vəhy vasitəsilə Peyğəmbərə ﷺ bildirildi." (əl-Buxari, 773)

---

[1] Qırmızı dənizin şərq sahili boyu olanərazidir.
[2] Nəxl – Məkkə ilə Taif arasında olan bir yerdir.
[3] Bu bazar cahiliyyət dövründə Məkkənin yaxınlığında yerləşirdi.
[4] "əl-Cinn" surəsi.

٤٤٥ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ قَرَأَ النَّبِيُّ ﷺ فِيمَا أُمِرَ، وَسَكَتَ فِيمَا أُمِرَ: ﴿وَمَا كَانَ رَبُّكَ نَسِيًّا﴾ ﴿لَّقَدْ كَانَ لَكُمْ فِي رَسُولِ ٱللَّهِ أُسْوَةٌ حَسَنَةٌ﴾. [رواه البخاري: ٧٧٤]

**445.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbərə ﷺ (oxumaq) əmr edildikdə oxuyar, (susmaq) əmr olunduqda isə susardı."[1]

(Uca Allah buyurur:) "Sənin Rəbbin unudan deyildir"[2], "Allahın elçisi sizlərə gözəl nümunədir"[3] (əl-Buxari, 774).

## ١٦– باب: الْجَمْعُ بَيْنَ السُّورَتَيْنِ فِي الرَّكْعَةِ وَالْقِرَاءَةِ بِالْخَوَاتِيمِ وَبِسُورَةٍ قَبْلَ سُورَةٍ وَبِأَوَّلِ سُورَةٍ

## 16-cı fəsil. Bir rükətdə iki surənin oxunması, surələrin sonuncu ayələrinin oxunması, əvvəlkindən qabaq gələn surənin oxunması, surənin əvvəlindən (bir neçə ayənin) oxunması

٤٤٦ – عَنْ ابْنِ مَسْعُودٍ رضي الله عنه، أَنَّهُ جَاءَهُ رَجُلٌ فَقَالَ: قَرَأْتُ الْمُفَصَّلَ اللَّيْلَةَ فِي رَكْعَةٍ، فَقَالَ: هَذًّا كَهَذِّ الشِّعْرِ لَقَدْ عَرَفْتُ النَّظَائِرَ الَّتِي كَانَ النَّبِيُّ ﷺ يَقْرِنُ بَيْنَهُنَّ فَذَكَرَ عِشْرِينَ سُورَةً مِنَ الْمُفَصَّلِ سُورَتَيْنِ فِي كُلِّ رَكْعَةٍ. [رواه البخاري: ٧٧٥]

**446.** Rəvayət edilir ki, bir nəfər ibn Məsudun رضي الله عنه yanına gəlib dedi: "Bu gecə mən bir rükətdə müfəssəl surələrin[4] hamısını oxudum." İbn Məsud رضي الله عنه dedi: "(Yəqin sən surələri) şeir oxunulan kimi tələm-tələsik (oxumusan). Mən Peyğəmbərin ﷺ (hər rükətdə) birləşdirərək oxuduğu, (mənaca) bir-birinə oxşar olan (surələri) bilirəm." Sonra da hər rükətdə iki surəni qeyd edərək müfəssəl surələrdən iyirmisini sadaladı.[5] (əl-Buxari, 775)

## ١٧– باب: يَقْرَأُ فِي الأُخْرَيَيْنِ بِفَاتِحَةِ الْكِتَابِ

## 17-ci fəsil. (Dörd rükətli namazlarda) son iki rükəti qılarkən "əl-Fatihə" surəsini oxumaq

٤٤٧ – عَنْ أَبِي قَتَادَةَ رضي الله عنه: أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَقْرَأُ فِي الظُّهْرِ فِي الأُولَيَيْنِ بِأُمِّ الْكِتَابِ وَسُورَتَيْنِ، وَفِي الرَّكْعَتَيْنِ الأُخْرَيَيْنِ بِأُمِّ الْكِتَابِ، وَيُسْمِعُنَا الآيَةَ، وَيُطَوِّلُ فِي الرَّكْعَةِ الأُولَى مَا لاَ يُطَوِّلُ فِي الرَّكْعَةِ الثَّانِيَةِ، وَهَكَذَا فِي الْعَصْرِ وَهَكَذَا فِي الصُّبْحِ. [رواه البخاري: ٧٧٦]

---

[1] Burada Peyğəmbərin ﷺ sübh, məğrib və işa namazlarını səslə, zöhr və əsr namazlarını isə səssiz oxumağı nəzərdə tutulur..

[2] "Məryəm" surəsi, 64.

[3] "əl-Əhzab" surəsi, 21.

[4] 416-cı hədisin şərhinə bax.

[5] Rəvayət edilir ki, ibn Məsud رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ mənaca bir-birinə oxşar olan surələrdən hər rükətdə ikisini oxuyardı: bir rükətdə ən-Nəcm və ər-Rəhman surələrini, bir rükətdə əl-Qəmər və əl-Həqqa surələrini, bir rükətdə ət-Tur və əz-Zariyat surələrini, bir rükətdə əl-Vaqiə və əl-Qələm surələrini, bir rükətdə əl-Məaric və ən-Naziat surələrini, bir rükətdə əl-Mutaffifin və Əbəsə surələrini, bir rükətdə əl-Muddəssir və əl-Muzzəmmil surələrini, bir rükətdə əl-İnsan və əl-Qiyamə surələrini, bir rükətdə ən-Nəbə və əl-Mursalat surələrini, bir rükətdə əd-Duxan və ət-Təkvir surələrini." (Səhih Əbu Davud, 1244)

**447.** Əbu Qətadə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ zöhr namazının ilk iki rükətində əl-Fatihə surəsini və (üstəlik hər rükətdə) bir surə oxuyardı, son iki rükətdə isə ancaq "əl-Fatihə" surəsini (oxuyardı), hərdən ayələri (bizə) eşitdirərdi, birinci rükəti uzadar, ikincisini isə qısa qılardı. Həmçinin, əsr və sübh namazlarında da belə edərdi. (əl-Buxari, 776)

## ١٨– باب: جَهْرُ الإِمَامِ بِالتَّأْمِينِ

## 18-ci fəsil. İmamın "Amin" sözünü səslə deməsi

٤٤٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «إِذَا أَمَّنَ الإِمَامُ فَأَمِّنُوا فَإِنَّهُ مَنْ وَافَقَ تَأْمِينُهُ تَأْمِينَ الْمَلاَئِكَةِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ» [رواه البخاري: ٧٨٠]

**448.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İmam "Amin" deyəndə, siz də "Amin" deyin! Bilin ki, kimin "Amin" deməsi mələklərin "Amin" deməsi ilə üst-üstə düşərsə, onun keçmiş günahları bağışlanar" (əl-Buxari, 780).

## ١٩– باب: فَضْلُ التَّأْمِينِ

## 19-cu fəsil. "Amin" deməyin fəziləti

٤٤٩ – عَنْهُ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا قَالَ أَحَدُكُمْ آمِينَ، وَقَالَتِ الْمَلاَئِكَةُ فِى السَّمَاءِ آمِينَ، فَوَافَقَتْ إِحْدَاهُمَا الأُخْرَى، غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ». [رواه البخاري: ٧٨١]

**449.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz "Amin" deyəndə göydəki mələklər də "Amin" deyirlər, əgər bu sözlər eyni vaxtda deyilərsə, ("Amin") deyən adamın keçmiş günahları bağışlanar." (əl-Buxari, 781)

## ٢٠– باب: إِذَا رَكَعَ دُونَ الصَّفِّ

## 20-ci fəsil. Cərgələrə daxil olmamış rüku etmək haqqında

٤٥٠ – عَنْ أَبِي بَكْرَةَ ﷺ، أَنَّهُ انْتَهَى إِلَى النَّبِيِّ ﷺ وَهُوَ رَاكِعٌ، فَرَكَعَ قَبْلَ أَنْ يَصِلَ إِلَى الصَّفِّ، فَذَكَرَ ذَلِكَ لِلنَّبِيِّ ﷺ فَقَالَ: «زَادَكَ اللَّهُ حِرْصًا وَلاَ تَعُدْ». [رواه البخاري: ٧٨٣]

**450.** Rəvayət edilir ki, bir dəfə Peyğəmbər ﷺ rükuda ikən Əbu Bəkrə ﷺ onun yanına gəldi və cərgələrə daxil olmamış rükuya getdi. Sonra o, bu haqda Peyğəmbərə ﷺ xəbər verdi, Peyğəmbər ﷺ də buyurdu: "Allah sənin canfəşanlığını artırsın, ancaq bir də belə etmə!" (əl-Buxari, 783)

## ٢١– باب: إِتْمَامُ التَّكْبِيرِ فِى الرُّكُوعِ

## 21-ci fəsil. Rükuya getdikdə "Allahu Əkbər" sözünü tam tələffüz etmək

٤٥١ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ﷺ قَالَ صَلَّى مَعَ عَلِيٍّ ﷺ بِالْبَصْرَةِ فَقَالَ: ذَكَّرَنَا هَذَا الرَّجُلُ صَلاَةً كُنَّا نُصَلِّيهَا مَعَ رَسُولِ اللَّهِ ﷺ فَذَكَرَ أَنَّهُ كَانَ يُكَبِّرُ كُلَّمَا رَفَعَ وَكُلَّمَا وَضَعَ. [رواه البخاري: ٧٨٤]

**451.** Rəvayət edilir ki, (bir dəfə) İmran ibn Husayn ﷺ Bəsrədə Əli ﷺ ilə birgə namaz qıldıqdan sonra demişdir: "Bu adam bizə Peyğəmbərlə ﷺ birgə qıldığımız namazı xatırlatdı." (İmran) onun hər dəfə qalxanda və hər dəfə əyiləndə "Allahu Əkbər" dediyini də xəbər vermişdir. (əl-Buxari, 784)

## ٢٢– باب: التَّكْبِيرُ إِذَا قَامَ مِنَ السُّجُودِ

## 22-ci fəsil. Səcdədən qalxarkən "Allahu Əkbər" demək

٤٥٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ يَقُولُ كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا قَامَ إِلَى الصَّلَاةِ يُكَبِّرُ حِينَ يَقُومُ، ثُمَّ يُكَبِّرُ حِينَ يَرْكَعُ، ثُمَّ يَقُولُ سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ حِينَ يَرْفَعُ صُلْبَهُ مِنَ الرَّكْعَةِ، ثُمَّ يَقُولُ وَهُوَ قَائِمٌ: رَبَّنَا لَكَ الْحَمْدُ. [رواه البخاري: ٧٨٩]

**452.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ namaza durarkən "Allahu Əkbər" deyərdi. Habelə, rükuya gedərkən də "Allahu Əkbər" deyərdi. Rükudan qalxıb belini dikəldərkən "Səmi Allahu limən həmidəh"[1] deyər, qalxıb dikəldikdən sonra isə "Rabbənə ləkəl həmd"[2] deyərdi. (əl-Buxari, 789)

## ٢٣– باب: وَضْعُ الأَكُفِّ عَلَى الرُّكَبِ فِى الرُّكُوعِ

## 23-cü fəsil. Rükuda əlləri dizlərə qoymaq

٤٥٣ – عَنْ مُصْعَبِ بْنِ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ﷺ يَقُولُ: صَلَّيْتُ إِلَى جَنْبِ أَبِى فَطَبَّقْتُ بَيْنَ كَفَّيَّ ثُمَّ وَضَعْتُهُمَا بَيْنَ فَخِذَيَّ، فَنَهَانِى أَبِى وَقَالَ كُنَّا نَفْعَلُهُ فَنُهِينَا عَنْهُ، وَأُمِرْنَا أَنْ نَضَعَ أَيْدِيَنَا عَلَى الرُّكَبِ. [رواه البخاري: ٧٩٠]

**453.** Rəvayət edilir ki, Musab ibn Səd ibn Əbu Vəqqas ﷺ demişdir: "(Bir dəfə) mən atamın yanında namaz qıldım və (rükuda) əllərimi birləşdirib ayaqlarımın arasında tutdum. Atam bunu mənə qadağan etdi və dedi: "Biz də belə edirdik, lakin bu bizə qadağan olundu və bizə əllərimizi dizlərimizin üstünə qoymaq əmr edildi." (əl-Buxari, 790)

## ٢٤– باب: اسْتِوَاءُ الظَّهْرِ فِى الرُّكُوعِ وَ الاطْمِئْنَانُ فِيهِ

## 24-cü fəsil. Rükuda kürəyi düz tutmaq və rahat durmaq

٤٥٤ – عَنْ الْبَرَاءِ ﷺ قَالَ: كَانَ رُكُوعُ النَّبِيِّ ﷺ وَسُجُودُهُ وَبَيْنَ السَّجْدَتَيْنِ وَإِذَا رَفَعَ مِنَ الرُّكُوعِ، مَا خَلاَ الْقِيَامَ وَالْقُعُودَ، قَرِيبًا مِنَ السَّوَاءِ. [رواه البخاري: ٧٩٢]

**454.** Rəvayət edilir ki, Bəra ﷺ demişdir: "Peyğəmbərin ﷺ qiyamı[3] və (təşəhhüd[4] üçün) oturuşu istisna olmaqla rükuda, səcdədə, iki səcdə arasında (olan otu-

---

[1] 411-ci hədisin qeydlərinə bax.
[2] 425-ci hədisin qeydlərinə bax.
[3] Burada Peyğəmbərin ﷺ təkbir gətirdikdən rükuya gedənədək ayaq üstə olduğu hal nəzərdə tutulur.
[4] Təşəhhüd deyildikdə, ikinci və sonuncu rükətlərdə axırıncı səcdədən sonra oturub hədislərdə varid olan xüsusi duaları oxumaq qəsd edilir.

ruşda) və rükudan qalxıb dikəldikdə (sərf etdiyi vaxt) təxminən bərabər idi." (əl-Buxari, 792)

## 25-ci fəsil. Rükuda dua etmək

## ٢٥– باب: الدُّعَاءُ فِى الرُّكُوعِ

٤٥٥ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ كَانَ النَّبِىُّ ﷺ يَقُولُ فِى رُكُوعِهِ وَسُجُودِهِ: «سُبْحَانَكَ اللَّهُمَّ رَبَّنَا وَبِحَمْدِكَ، اللَّهُمَّ اغْفِرْ لِى». [رواه البخاري: ٧٩٤]

**455.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ rükuda və səcdədə: "Allahım! Sən pak və müqəddəssən. Ey Rəbbimiz! Sənə həmd olsun. Allahım, məni bağışla!"[1]– deyərdi. (əl-Buxari, 794)

٤٥٦ – عَنْهَا رضي الله عنها فِى رِوَايَةٍ أُخْرَى: يَتَأَوَّلُ الْقُرْآنَ [رواه البخاري: ٨١٧]

**456.** Aişədən رضي الله عنها rəvayət olunan digər hədisdə deyilir: "Quranda[2] (buyurulanı) yerinə yetirərdi." (əl-Buxari, 817)

## 26-cı fəsil. "Allahummə Rabbənə ləkəl həmd"[3] sözünün fəziləti

## ٢٦– باب: فَضْلُ اللَّهُمَّ رَبَّنَا لَكَ الْحَمْدُ

٤٥٧ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا قَالَ الإِمَامُ سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ، فَقُولُوا اللَّهُمَّ رَبَّنَا لَكَ الْحَمْدُ، فَإِنَّهُ مَنْ وَافَقَ قَوْلُهُ قَوْلَ الْمَلاَئِكَةِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ». [رواه البخاري: ٤٥٧]

**457.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İmam: "Səmi Allahu limən həmidəh" deyəndə siz: "Allahummə, Rabbənə ləkəl həmd" deyin. Bilin ki, kimin sözü mələklərin sözü ilə üst-üstə düşsə, onun keçmiş günahları bağışlanar." (əl-Buxari, 796)

## 27-ci fəsil

## ٢٧– باب

٤٥٨ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ: لأُقَرِّبَنَّ صَلاَةَ النَّبِىِّ ﷺ فَكَانَ أَبُو هُرَيْرَةَ رضي الله عنه يَقْنُتُ فِى الرَّكْعَةِ الآخِرَةِ مِنْ صَلاَةِ الظُّهْرِ وَصَلاَةِ الْعِشَاءِ، وَصَلاَةِ الصُّبْحِ، بَعْدَ مَا يَقُولُ سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ، فَيَدْعُو لِلْمُؤْمِنِينَ وَيَلْعَنُ الْكُفَّارَ. [رواه البخاري: ٧٩٧]

**458.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ namazına bənzər namaz qılacağam."

---

[1] Transkripsiyası: "Subhanəkə Allahummə Rabbənə və bihamdikə, Allahummə-ğfirli."

[2] Quran deyildikdə: "Həmd ilə Rəbbini təriflə və Ondan bağışlanmağını dilə. Həqiqətən, O, tövbələri qəbul edəndir!" ("ən-Nəsr" surəsinin 3-cü ayəsi) və başqa bu kimi ayələr qəsd edilir.

[3] Allahım, ey Rəbbimiz, həmd Sənə məxsusdur!

(Ravi deyir ki,) Əbu Hureyra ﷺ zöhr, işa və sübh namazlarının axırıncı rükətində: "Səmi Allahu limən həmidəh" deyəndən sonra (Allaha) üz tutub möminlər üçün dua[1] edər, kafirlərə isə lənət oxuyardı. (əl-Buxari, 797)

٤٥٩ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ الْقُنُوتُ فِي الْمَغْرِبِ وَالْفَجْرِ. [رواه البخاري: ٧٩٨]

**459.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "(Əshabələr) məğrib və sübh namazlarında dua edərdilər." (əl-Buxari, 798)

٤٦٠ – عَنْ رِفَاعَةَ بْنِ رَافِعٍ الزُّرَقِيِّ ﷺ قَالَ: كُنَّا يَوْمًا نُصَلِّي وَرَاءَ النَّبِيِّ ﷺ فَلَمَّا رَفَعَ رَأْسَهُ مِنَ الرَّكْعَةِ قَالَ: «سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ». قَالَ رَجُلٌ وَرَاءَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ، حَمْدًا كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ، فَلَمَّا انْصَرَفَ قَالَ: «مَنِ الْمُتَكَلِّمُ»، قَالَ: أَنَا، قَالَ: «رَأَيْتُ بِضْعَةً وَثَلاَثِينَ مَلَكًا يَبْتَدِرُونَهَا، أَيُّهُمْ يَكْتُبُهَا أَوَّلُ». [رواه البخاري: ٧٩٩]

**460.** Rəvayət edilir ki, Rifaa ibn Rafi əz-Zürəqi ﷺ demişdir: "Bir dəfə biz Peyğəmbərin ﷺ arxasında namaz qılırdıq. Rükudan başını qaldırıb: "Səmi Allahu limən həmidəh"– dedi. Arxasında duran bir nəfər isə: "Rabbənə və ləkəl-həmd, həmdən, kəsiran, tayyibən, mubarəkən fih"[2]– dedi. Peyğəmbər ﷺ namazı bitirdikdən sonra soruşdu: "Bunu deyən kim idi?" (Əshabə): "Mən"– dedi. (Onda Peyğəmbər ﷺ) buyurdu: "Mən otuzdan çox mələk gördüm ki, bu sözü hansı biri daha tez yazacaq deyə, bir-birini ötməyə çalışırdılar." (əl-Buxari, 799)

## ٢٨– باب: الاِطْمِئْنَانِيَّةُ حِينَ يَرْفَعُ رَأْسَهُ مِنَ الرُّكُوعِ

## 28-ci fəsil. Rükudan başını qaldırandan sonra rahat durmaq

٤٦١ – عَنْ أَنَسٍ ﷺ أَنَّهُ كَانَ يَنْعَتُ لَنَا صَلاَةَ النَّبِيِّ ﷺ فَكَانَ يُصَلِّي وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ قَامَ حَتَّى نَقُولَ قَدْ نَسِيَ. [رواه البخاري: ٨٠٠]

**461.** Rəvayət edilir ki, Ənəs ﷺ bizə Peyğəmbərin ﷺ necə namaz qıldğını göstərdi. O, namaz qılarkən rükudan başını qaldırdıqda ayaq üstə o qədər çox durardı ki, biz deyərdik: "O, (səcdə etməyi) unudub." (əl-Buxari, 800)

## ٢٩– باب: يَهْوِي بِالتَّكْبِيرِ حِينَ يَسْجُدُ

## 29-cu fəsil. Səcdəyə gedərkən "Allahu Əkbər" demək

٤٦٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ حِينَ يَرْفَعُ رَأْسَهُ يَقُولُ سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ، رَبَّنَا وَلَكَ الْحَمْدُ، يَدْعُو لِرِجَالٍ فَيُسَمِّيهِمْ بِأَسْمَائِهِمْ فَيَقُولُ: «اللَّهُمَّ أَنْجِ الْوَلِيدَ بْنَ الْوَلِيدِ وَسَلَمَةَ بْنَ هِشَامٍ وَعَيَّاشَ بْنَ أَبِي رَبِيعَةَ، وَالْمُسْتَضْعَفِينَ مِنَ الْمُؤْمِنِينَ، اللَّهُمَّ اشْدُدْ وَطْأَتَكَ عَلَى مُضَرَ، وَاجْعَلْهَا عَلَيْهِمْ سِنِينَ كَسِنِي يُوسُفَ». وَأَهْلُ الْمَشْرِقِ يَوْمَئِذٍ مِنْ مُضَرَ مُخَالِفُونَ لَهُ. [رواه البخاري: ٨٠٤]

---

[1] Namazın axırıncı rükətində rükudan sonra və ya əvvəl oxunan bu duaya qunut deyilir. Bu da hər zaman deyil, məhz çətinlik üz verdikdə, zəruri hallarda edilir.

[2] Tərcüməsi: Ey Rəbbimiz! Sənə həmd olsun, (özü də) çoxlu, xoş, mübarək bir həmd!

**462.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ rükudan başını qaldıranda: "Səmi Allahu limən həmidəh, Rabbənə və ləkəl həmd"– deyər, (hərdənbir də) bəzi adamlar üçün (Allaha) dua edər və onların adlarını çəkib deyərdi: "Allahım, Vəlid ibn Vəlidi, Sələmə ibn Hişamı, Ayyaş ibn Əbu Rəbiəni və möminlərdən zəif olanları xilas et! Allahım, Mudar qəbiləsinə olan əzabını şiddətləndir və onlara Yusufun zamanında göndərdiyin (yeddi qıtlıq və quraqlıq) illəri kimi illər göndər!"

O vaxt Mudar qəbiləsindən olan məşriq əhli ona müxalif idi. (əl-Buxari, 804)

## 30-cu fəsil. Səcdə etməyin fəziləti

## ٣٠- باب: فَضْلُ السُّجُودِ

٤٦٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ أَنَّ النَّاسَ قَالُوا: يَا رَسُولَ اللَّه، هَلْ نَرَى رَبَّنَا يَوْمَ الْقيَامَة؟ قَالَ: «هَلْ تُمَارُونَ في الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ لَيْسَ دُونَهُ سَحَابٌ». قَالُوا لاَ يَا رَسُولَ اللَّه، قَالَ: «فَهَلْ تُمَارُونَ في الشَّمْسِ لَيْسَ دُونَهَا سَحَابٌ». قَالُوا لاَ. قَالَ: «فَإِنَّكُمْ تَرَوْنَهُ كَذَلكَ، يُحْشَرُ النَّاسُ يَوْمَ الْقيَامَة، فَيَقُولُ مَنْ كَانَ يَعْبُدُ شَيْئًا فَلْيَتَّبِعْ. فَمنْهُمْ مَنْ يَتَّبِعُ الشَّمْسَ، وَمنْهُمْ مَنْ يَتَّبِعُ الْقَمَرَ وَمنْهُمْ مَنْ يَتَّبِعُ الطَّوَاغيتَ، وَتَبْقَى هَذه الأُمَّةُ فيهَا مُنَافقُوهَا، فَيَأْتيهِمُ اللَّهُ فَيَقُولُ أَنَا رَبُّكُمْ فَيَقُولُونَ هَذَا مَكَانُنَا حَتَّى يَأْتيَنَا رَبُّنَا، فَإِذَا جَاءَ رَبُّنَا عَرَفْنَاهُ. فَيَأْتيهِمُ اللَّهُ فَيَقُولُ أَنَا رَبُّكُمْ. فَيَقُولُونَ أَنْتَ رَبُّنَا. فَيَدْعُوهُمْ فَيُضْرَبُ الصِّرَاطُ بَيْنَ ظَهْرَانَيْ جَهَنَّمَ، فَأَكُونُ أَوَّلَ مَنْ يَجُوزُ منَ الرُّسُلِ بِأُمَّته، وَلاَ يَتَكَلَّمُ يَوْمَئذ أَحَدٌ إِلاَّ الرُّسُلُ، وَكَلاَمُ الرُّسُلِ يَوْمَئذ اللَّهُمَّ سَلِّمْ سَلِّمْ. وَفي جَهَنَّمَ كَلاَليبُ مثْلُ شَوْك السَّعْدَان، هَلْ رَأَيْتُمْ شَوْكَ السَّعْدَان» قَالُوا نَعَمْ. قَالَ: «فَإِنَّهَا مثْلُ شَوْك السَّعْدَان، غَيْرَ أَنَّهُ لاَ يَعْلَمُ قَدْرَ عظَمهَا إِلاَّ اللَّهُ، تَخْطَفُ النَّاسَ بِأَعْمَالهمْ، فَمنْهُمْ مَنْ يُوبَقُ بِعَمَله، وَمنْهُمْ مَنْ يُخَرْدَلُ ثُمَّ يَنْجُو، حَتَّى إِذَا أَرَادَ اللَّهُ رَحْمَةَ مَنْ أَرَادَ منْ أَهْلِ النَّار، أَمَرَ اللَّهُ الْمَلاَئكَةَ أَنْ يُخْرِجُوا مَنْ كَانَ يَعْبُدُ اللَّهَ، فَيُخْرِجُونَهُمْ وَيَعْرِفُونَهُمْ بِآثَارِ السُّجُود، وَحَرَّمَ اللَّهُ عَلَى النَّارِ أَنْ تَأْكُلَ أَثَرَ السُّجُود فَيَخْرُجُونَ منَ النَّار، فَكُلُّ ابْنِ آدَمَ تَأْكُلُهُ النَّارُ إِلاَّ أَثَرَ السُّجُود، فَيَخْرُجُونَ منَ النَّار قَد امْتَحَشُوا، فَيُصَبُّ عَلَيْهِمْ مَاءُ الْحَيَاة، فَيَنْبُتُونَ كَمَا تَنْبُتُ الْحبَّةُ في حَميلِ السَّيْل، ثُمَّ يَفْرُغُ اللَّهُ منَ الْقَضَاء بَيْنَ الْعبَاد، وَيَبْقَى رَجُلٌ بَيْنَ الْجَنَّة وَالنَّار، وَهْوَ آخرُ أَهْلِ النَّارِ دُخُولاً الْجَنَّةَ، مُقْبِلٌ بِوَجْهه قبَلَ النَّار فَيَقُولُ يَا رَبِّ اصْرِفْ وَجْهي عَنِ النَّار، قَدْ قَشَبَني رِيحُهَا، وَأَحْرَقَني ذَكَاؤُهَا. فَيَقُولُ هَلْ عَسَيْتَ إِنْ فُعلَ ذَلكَ بِكَ أَنْ تَسْأَلَ غَيْرَ ذَلكَ فَيَقُولُ لاَ وَعزَّتكَ. فَيُعْطي اللَّهَ مَا يَشَاءُ منْ عَهْد وَميثَاق، فَيَصْرِفُ اللَّهُ وَجْهَهُ عَنِ النَّار، فَإِذَا أَقْبَلَ به عَلَى الْجَنَّة رَأَى بَهْجَتَهَا سَكَتَ مَا شَاءَ اللَّهُ أَنْ يَسْكُتَ، ثُمَّ قَالَ يَا رَبِّ قَدِّمْني عنْدَ بَاب الْجَنَّة. فَيَقُولُ اللَّهُ لَهُ أَلَيْسَ قَدْ أَعْطَيْتَ الْعُهُودَ وَالْمَوَاثيقَ أَنْ لاَ تَسْأَلَ غَيْرَ الَّذي كُنْتَ سَأَلْتَ فَيَقُولُ يَا رَبِّ لاَ أَكُونُ أَشْقَى خَلْقكَ. فَيَقُولُ فَمَا عَسَيْتَ إِنْ أُعْطيتَ ذَلكَ أَنْ لاَ تَسْأَلَ غَيْرَهُ فَيَقُولُ لاَ وَعزَّتكَ لاَ أَسْأَلُ غَيْرَ ذَلكَ. فَيُعْطي رَبَّهُ مَا شَاءَ منْ عَهْد وَميثَاق، فَيُقَدِّمُهُ إِلَى بَاب الْجَنَّة، فَإِذَا بَلَغَ بَابَهَا، فَرَأَى زَهْرَتَهَا وَمَا فيهَا منَ النَّضْرَة وَالسُّرُور، فَيَسْكُتُ مَا شَاءَ اللَّهُ أَنْ يَسْكُتَ، فَيَقُولُ يَا رَبِّ أَدْخلْني الْجَنَّةَ. فَيَقُولُ اللَّهُ وَيْحَكَ يَا ابْنَ آدَمَ مَا أَغْدَرَكَ، أَلَيْسَ قَدْ أَعْطَيْتَ الْعَهْدَ وَالْميثَاقَ أَنْ لاَ تَسْأَلَ غَيْرَ الَّذي أُعْطيتَ فَيَقُولُ يَا رَبِّ لاَ تَجْعَلْني أَشْقَى خَلْقكَ. فَيَضْحَكُ اللَّهُ عَزَّ وَجَلَّ منْهُ، ثُمَّ يَأْذَنُ لَهُ في دُخُول الْجَنَّة فَيَقُولُ تَمَنَّ. فَيَتَمَنَّى حَتَّى إِذَا انْقَطَعَتْ أُمْنيَّتُهُ قَالَ اللَّهُ عَزَّ وَجَلَّ تَمَنَّ كَذَا وَكَذَا. أَقْبَلَ يُذَكِّرُهُ رَبُّهُ، حَتَّى إِذَا انْتَهَتْ به الأَمَانيُّ قَالَ اللَّهُ تَعَالَى لَكَ ذَلكَ وَمثْلُهُ مَعَهُ»

قَالَ أَبُو سَعيد الْخُدْريُّ ﵁ لأَبي هُرَيْرَةَ ﵁ إِنَّ رَسُولَ اللَّه ﷺ قَالَ: «قَالَ اللَّهُ لَكَ ذَلكَ وَعَشَرَةُ أَمْثَاله». قَالَ أَبُو هُرَيْرَةَ ﵁ لَمْ أَحْفَظْ منْ رَسُول اللَّه ﷺ إِلاَّ قَوْلَهُ: «لَكَ ذَلكَ وَمثْلُهُ مَعَهُ». قَالَ أَبُو سَعيد ﵁ إِنِّي سَمعْتُهُ يَقُولُ: «ذَلكَ لَكَ وَعَشَرَةُ أَمْثَاله». [رواه البخاري: ٨٠٦]

**463.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) camaat soruşdu: "Ey Allahın elçisi! Qiyamət günü Rəbbimizi görə biləcəyikmi?" (Peyğəmbər ﷺ) dedi: "Məgər siz buludla örtülməmiş on dörd gecəlik ayı (görəcəyinizə) şübhə edirsiniz?" Onlar: "Xeyr, ey Allahın elçisi!"– deyə cavab verdilər. (Peyğəmbər ﷺ) dedi: "Məgər siz buludla örtülməmiş günəşi (görəcəyinizə) şübhə edirsiniz?" Onlar: "Xeyr!"– dedilər. (Peyğəmbər ﷺ) buyurdu: "Rəbbinizi də beləcə görəcəksiniz. Qiyamət günü insanlar məhşərə toplanacaq və Allah buyuracaq: "Kim nəyə ibadət edirdisə, qoy onun ardınca getsin!" Beləliklə, onlardan kimisi günəşin, kimisi ayın, kimisi də tağutların[1] ardınca gedəcək. Axırda bu ümmət, içində olan münafiqlərlə birlikdə qalacaqlar. Allah onların yanına gəlib buyuracaq: "Mən sizin Rəbbinizəm!" Onlar (Onu tanımadıqlarına görə) deyəcəklər: "Rəbbimiz gələnədək bura bizim yerimiz (olacaq), Rəbbimiz gələndə biz Onu tanıyacağıq." Sonra Allah onların yanına gəlib buyuracaq: "Mən sizin Rəbbinizəm!" Onlar (Onu tanıyacaq və): "Sən bizim Rəbbimizsən!"– deyəcəklər. (Bundan sonra) Allah onları çağıracaq, Cəhənnəmin üzərində körpü[2] qurulacaq və ümməti ilə birlikdə bu körpüdən keçən elçilərin birincisi mən olacağam. O gün elçilərdən başqa heç kəs danışa bilməyəcək, elçilər isə deyəcəklər: "Allahım, xilas et, xilas et!" Cəhənnəmdə sadan[3] tikanlarına bənzər qarmaqlar vardır. Siz sadan tikanlarını görmüsünüzmü?" (Əshabələr): "Bəli"– dedilər. (Peyğəmbər ﷺ) buyurdu: "Bu qarmaqlar sadan tikanlarına bənzəyirlər, lakin Allahdan başqa heç kəs onların nə qədər böyük olduğunu bilmir. Onlar insanları əməllərinə görə tutacaqlar, kimisi əməlinə görə məhv olacaq, kimisi də didik-didik ediləcək, lakin axırda xilas olacaq. Nəhayət Allah Cəhənnəmə vasil olanlardan dilədiyinə mərhəmət göstərmək istədiyi zaman mələklərə Allaha ibadət etmiş kimsələri (oradan) çıxarmağı əmr edəcək. Mələklər onları (üzlərindəki) səcdə izindən tanıyıb (oradan) çıxaracaqlar. Belə ki, Allah Cəhənnəm oduna səcdə izlərini yandırıb-yaxmağı haram etmişdir. Beləliklə, onlar Cəhənnəmdən çıxacaqlar. Od Adəm övladının vücudunu – səcdə yerləri istisna olmaqla, başdan-ayağa yandırıb-yaxacaq və onlar sümüklərinə qədər yanmış halda oddan çıxacaqlar. Bundan sonra onların üstünə dirilik suyu töküləcək və onlar selin gətirdiyi toxumun cücərib yetişdiyi kimi diriləcəklər. Nəhayət Allah Öz qulları üzərində mühakiməsini bitirdikdə Cənnətlə Cəhənnəm arasında bir nəfər qalacaq. Bu adam Cəhənnəmdən çıxıb Cənnətə girən kimsələrin axırıncısı olacaq. Onun üzü Cəhənnəmə tərəf olacaq və o deyəcək: "Ey Rəbbim, mənim üzümü oddan döndər, çünki onun tüstüsü məni zəhərləmişdir, alovu da məni yandırıb-yaxmışdır!" Allah deyəcək: "Bu istədiyin yerinə yetirilsə, başqa bir şey istəyəcəksənmi?" (Bu adam): "Sənin izzətinə and olsun ki, yox"– deyəcək və Allaha dilədiyi qədər and içib söz verəcək. Allah da onun üzünü oddan döndərəcək. Allah onun üzünü Cənnətə tərəf çevirdikdə o, (Cənnətin) gözəlliyini görüb Allahın istədiyi qədər susacaq, sonra isə deyəcək: "Ey Rəbbim, məni Cənnətin

---

[1] Tağut sözü aşağıdakı kimi izah olunur:
(a) Uca Allahla yanaşı ilahiləşdirilən və ibadət olunan hər hansı bir məxluq; (b) Allahın haram buyurduqlarına məhəl qoymayan günahkar; (c) şeytan və iblis; (ç) cadugərlər və baxıcılar; (d) insanları aldadan və Allahın şəriətinə zidd olan qanunlar qəbul edən kafirlər; (e) büt yerləşdirilən məbəd.
[2] Tərcümədə buna Sirat, qıl körpüsü deyilir.
[3] Dadı şirin tikanlı bir bitkidir.

qapısına yaxınlaşdır." Allah ona deyəcək: "Məgər sən and içib söz verməmişdin ki, bu istədiyindən başqa heç nə istəməyəcəksən?" O deyəcək: "Ey Rəbbim, qoy Sənin yaratdıqlarının ən bədbəxti mən olmayım!" Allah deyəcək: "Bu istədiyin yerinə yetirilsə, başqa bir şey istəyəcəksənmi?" O (yenə): "Sənin izzətinə and olsun ki, mən başqa heç nə istəməyəcəyəm"- deyəcək və Allaha dilədiyi qədər and içib söz verəcək. Allah da onu Cənnətin qapısına yaxınlaşdıracaq. Cənnətin qapısına çatdıqda onun gözəlliyini, içindəki sevinc və zövq-səfanı görüb Allahın istədiyi qədər susacaq, sonra da deyəcək: "Ey Rəbbim, məni Cənnətə daxil et!" Allah deyəcək: "Vay sənin halına, ey Adəm oğlu, sən nə qədər vədinə xilaf çıxırsan! Məgər sən and içib söz verməmişdin ki, sənə verilənlərdən başqa heç nə istəməyəcəksən?" O deyəcək: "Ey Rəbbim, qoy Sənin yaratdıqlarının ən bədbəxti mən olmayım!" Belə olduqda Qüdrətli və Böyük Allah güləcək, sonra ona Cənnətə daxil olmağa izn verəcək və deyəcək: "(Nə diləyirsən,) dilə!" O adam o qədər diləyəcək ki, axırda (heç bir) diləyi qalmayacaq və Qüdrətli və Böyük Allah deyəcək: "Filan və filan şeyləri də dilə!" Beləcə, Rəbbi ona (onun istəklərini) xatırladacaq. Artıq onun heç bir istəyi qalmadıqda Uca Allah buyuracaq: "Sənə bu istədiklərin və bir o qədəri də (verilmişdir)."

Əbu Səid əl-Xudri ﵁ Əbu Hureyraya demişdir: "Peyğəmbər ﷺ demişdir ki, Allah buyuracaq: "Sənə bu istədiklərin, üstəlik onun on misli (verilmişdir)." Əbu Hureyra da (ona belə) cavab vermişdir: "Mən Peyğəmbərin ﷺ: "Sənə bu istədiklərin və bir o qədəri də (verilmişdir)"– dediyini yadda saxlamışam. Əbu Səid əl-Xudri demişdir: "Mən isə onun: "Sənə bu istədiklərin, üstəlik onun on misli (verilmişdir)"– dediyini eşitmişəm. (əl-Buxari, 806)

## 31-ci fəsil. Yeddi əza üzərinə səcdə etmək

## ٣١– باب: السُّجُودُ عَلَى سَبْعَةِ أَعْظُمٍ

٤٦٤ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ، قَالَ النَّبِيُّ ﷺ: «أُمِرْتُ أَنْ أَسْجُدَ عَلَى سَبْعَةِ أَعْظُمٍ عَلَى الْجَبْهَةِ – وَأَشَارَ بِيَدِهِ عَلَى أَنْفِهِ – وَالْيَدَيْنِ، وَالرُّكْبَتَيْنِ وَأَطْرَافِ الْقَدَمَيْنِ، وَلاَ نَكْفِتَ الثِّيَابَ وَالشَّعَرَ». [رواه البخاري: ٨١٢]

**464.** İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənə, paltarın (ətəyini) və saçı yığmadan yeddi əza – alın, əllər, dizlər və ayaq barmaqlarının ucları üzərinə səcdə etmək əmr edilmişdi." (Peyğəmbər ﷺ alın deyəndə) burnuna da işarə etdi.[1] (əl-Buxari, 812)

## 32-ci fəsil. İki səcdə arasında oturmaq

## ٣٢– باب: الْمُكْثُ بَيْنَ السَّجْدَتَيْنِ

٤٦٥ – عَنْ أَنَسٍ ﵁ قَالَ: إِنِّى لاَ آلُو أَنْ أُصَلِّيَ بِكُمْ كَمَا رَأَيْتُ النَّبِيَّ ﷺ يُصَلِّى بِنَا.
قَالَ ثَابِتٌ كَانَ أَنَسٌ يَصْنَعُ شَيْئًا لَمْ أَرَكُمْ تَصْنَعُونَهُ، كَانَ إِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ قَامَ حَتَّى يَقُولَ الْقَائِلُ قَدْ نَسِيَ. وَبَيْنَ السَّجْدَتَيْنِ حَتَّى يَقُولَ الْقَائِلُ قَدْ نَسِيَ. [رواه البخاري: ٨٢١]

[1] Bu dəlalət edir ki, səcdə etdikdə alınla bərabər burun da yerə dəyməlidir.

**465.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Mən çalışıram ki, namazı sizə Peyğəmbərin ﷺ bizə namaz qıldırdığını gördüyüm kimi qıldırım.”

Sabit ﷺ demişdir: “Ənəs ﷺ elə şeylər edirdi ki, indi mən sizin o şeyləri etdiyinizi görmürəm. O, rükudan başını qaldırdıqda ayaq üstə o qədər çox durardı ki, bəziləri deyərdilər: “O, (səcdə etməyi) unudub”, habelə iki səcdə arasında o qədər çox durardı ki, bəziləri deyərdilər: “O, (ikinci səcdəni) unudub. (əl-Buxari, 821)

## ٣٣– باب: لاَ يَفْتَرِشُ ذِرَاعَيْهِ فِى السُّجُودِ

## 33-cü fəsil. Səcdədə dirsəkləri yerə qoymamaq

٤٦٦ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «اعْتَدِلُوا فِى السُّجُودِ، وَلاَ يَبْسُطْ أَحَدُكُمْ ذِرَاعَيْهِ انْبِسَاطَ الْكَلْبِ». [رواه البخاري: ٨٢٢]

**466.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Səcdələrinizi doğru-düzgün yerinə yetirin. Qoy sizlərdən heç kəs (səcdədə) dirsəklərini it kimi yerə qoymasın.” (əl-Buxari, 822)

## ٣٤– باب: مَنِ اسْتَوَى قَاعِدًا فِى وِتْرٍ مِنْ صَلاَتِهِ ثُمَّ نَهَضَ

## 34-cü fəsil. Namazın tək rükətlərini tamamladıqda bir qədər oturduqdan sonra ayağa qalxmaq

٤٦٧ – عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ اللَّيْثِيِّ ﷺ، أَنَّهُ رَأَى النَّبِيَّ ﷺ يُصَلِّى، فَإِذَا كَانَ فِى وِتْرٍ مِنْ صَلاَتِهِ لَمْ يَنْهَضْ حَتَّى يَسْتَوِيَ قَاعِدًا. [رواه البخاري: ٨٢٣]

**467.** Malik ibn Huveyris əl-Leysi ﷺ rəvayət edir ki, o, Peyğəmbərin ﷺ necə namaz qıldığını görmüşdür. Peyğəmbər ﷺ qıldığı namazın tək rükətlərində (ikinci səcdədən sonra) oturub qəddini düzəltməyincə ayağa qalxmazdı. (əl-Buxari, 823)

## ٣٥– باب: يُكَبِّرُ وَهْوَ يَنْهَضُ مِنَ السَّجْدَتَيْنِ

## 35-ci fəsil. İki səcdə etdikdən sonra ayağa qalxan kimsənin “Allahu Əkbər” deməsi

٤٦٨ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ، أَنَّهُ صَلَّى فَجَهَرَ بِالتَّكْبِيرِ حِينَ رَفَعَ رَأْسَهُ مِنَ السُّجُودِ، وَحِينَ سَجَدَ، وَحِينَ رَفَعَ، وَحِينَ قَامَ مِنَ الرَّكْعَتَيْنِ وَقَالَ: هَكَذَا رَأَيْتُ النَّبِيَّ ﷺ. [رواه البخاري: ٨٢٥]

**468.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ (camaata) namaz qıldırdıqda səcdədən başını qaldırarkən, səcdəyə gedərkən, (bir daha) səcdədən (başını) qaldırarkən və ikinci rükəti bitirdikdən sonra ayağa qalxarkən uca səslə: “Allahu Əkbər”– deyərdi.

(Əbu Səid) dedi: “Mən Peyğəmbərin ﷺ belə etdiyini görmüşəm” (əl-Buxari, 825).

## 36-cı fəsil. Təşəhhüdü[1] oxuyanda Sünnəyə[2] müvafiq qaydada oturmaq

## ٣٦- باب: سُنَّةُ الْجُلُوسِ فِى التَّشَهُّدِ

٤٦٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﵄ أَنَّهُ كَانَ يَرَى عَبْدَ اللَّهِ بْنَ عُمَرَ ﵄ يَتَرَبَّعُ فِى الصَّلاَةِ إِذَا جَلَسَ، فَفَعَلْتُهُ وَأَنَا يَوْمَئِذٍ حَدِيثُ السِّنِّ، فَنَهَانِى عَبْدُ اللَّهِ بْنُ عُمَرَ وَقَالَ إِنَّمَا سُنَّةُ الصَّلاَةِ أَنْ تَنْصِبَ رِجْلَكَ الْيُمْنَى وَتَثْنِىَ الْيُسْرَى. فَقُلْتُ إِنَّكَ تَفْعَلُ ذَلِكَ. فَقَالَ إِنَّ رِجْلَىَّ لاَ تَحْمِلاَنِى. [رواه البخاري: ٨٢٧]

**469.** Abdullah ibn Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, o, Abdullah ibn Ömərin namazda oturanda[3] ayaqlarını çarpaz qoyduğunu görərdi.

(Abdullah deyir ki:) "O vaxt cavan idim deyə mən də belə etdim, lakin Abdullah ibn Ömər (bunu) mənə qadağan edib dedi: "Namazda (Sünnəyə müvafiq qaydada) oturmaq (üçün) sağ ayağının pəncəsini şaquli vəziyyətdə qoymalı və sol ayağını büküb üstündə oturmalısan." Mən dedim: "Axı sən belə edirsən." O dedi: "Ayaqlarım məni saxlamır (deyə belə edirəm)." (əl-Buxari, 827)

٤٧٠ – عَنْ أَبِى حُمَيْدٍ السَّاعِدِىِّ ﵁ قَالَ: أَنَا كُنْتُ أَحْفَظَكُمْ لِصَلاَةِ رَسُولِ اللَّهِ ﷺ رَأَيْتُهُ إِذَا كَبَّرَ جَعَلَ يَدَيْهِ حِذَاءَ مَنْكِبَيْهِ، وَإِذَا رَكَعَ أَمْكَنَ يَدَيْهِ مِنْ رُكْبَتَيْهِ، ثُمَّ هَصَرَ ظَهْرَهُ، فَإِذَا رَفَعَ رَأْسَهُ اسْتَوَى حَتَّى يَعُودَ كُلُّ فَقَارٍ مَكَانَهُ، فَإِذَا سَجَدَ وَضَعَ يَدَيْهِ غَيْرَ مُفْتَرِشٍ وَلاَ قَابِضِهِمَا، وَاسْتَقْبَلَ بِأَطْرَافِ أَصَابِعِ رِجْلَيْهِ الْقِبْلَةَ، فَإِذَا جَلَسَ فِى الرَّكْعَتَيْنِ جَلَسَ عَلَى رِجْلِهِ الْيُسْرَى وَنَصَبَ الْيُمْنَى، وَإِذَا جَلَسَ فِى الرَّكْعَةِ الآخِرَةِ قَدَّمَ رِجْلَهُ الْيُسْرَى وَنَصَبَ الأُخْرَى وَقَعَدَ عَلَى مَقْعَدَتِهِ. [رواه البخاري: ٨٢٨]

**470.** Rəvayət edir ki, Əbu Humeyd əs-Saidi ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ necə namaz qıldığını hamınızdan yaxşı yadda saxlamışam. Mən görmüşəm ki, o: "Allahu Əkbər" deyəndə əllərini çiyinləri bərabərinə qaldırardı, rükuya gedəndə əllərini dizlərinə qoyar və belini dümdüz saxlayardı, (rükudan) başını qaldıranda bütün fəqərələri öz yerinə düşənə qədər qəddini düzəldərdi, səcdəyə gedəndə əllərini yerə elə qoyardı ki, nə dirsəkləri yerə dəyər, nə də böyrünə toxunardı, ayaq barmaqlarının uclarını isə qibləyə tərəf yönəldərdi, ikinci rükətdə (təşəhhüdü oxumaq üçün) oturanda sol ayağının üstündə oturar və sağ ayağının pəncəsini şaquli vəziyyətdə tutardı, axırıncı rükətdə oturanda isə sol ayağını sağ tərəfə çəkər, sağ ayağının pəncəsini şaquli vəziyyətdə tutar və sol yanı üstə oturardı." (əl-Buxari, 828)

## 37-ci fəsil. Birinci təşəhhüdün deyilməsini vacib saymayanlar

## ٣٧- باب: مَنْ لَمْ يَرَ التَّشَهُّدَ الأَوَّلَ وَاجِبًا

٤٧١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ بُحَيْنَةَ ﵁ وَهُوَ مِنْ أَزْدِ شَنُوءَةَ، وَهُوَ حَلِيفٌ لِبَنِى عَبْدِ مَنَافٍ، وَكَانَ مِنْ أَصْحَابِ النَّبِىِّ ﷺ، أَنَّ النَّبِىَّ ﷺ صَلَّى بِهِمُ الظُّهْرَ فَقَامَ فِى الرَّكْعَتَيْنِ الأُولَيَيْنِ لَمْ يَجْلِسْ، فَقَامَ النَّاسُ مَعَهُ حَتَّى إِذَا قَضَى الصَّلاَةَ، وَانْتَظَرَ النَّاسُ تَسْلِيمَهُ، كَبَّرَ وَهْوَ جَالِسٌ، فَسَجَدَ سَجْدَتَيْنِ قَبْلَ أَنْ يُسَلِّمَ ثُمَّ سَلَّمَ. [رواه البخاري: ٨٢٨]

[1] Təşəhhüd sözünün hərfi mənası – Allahın Təkliyinə və Muhəmmədin ﷺ Onun qulu və elçisi olduğuna şəhadət gətirməkdir. Lakin burada təşəhhüd deyiləndə namazın ikinci və axırıncı rükətlərində ikinci səcdədən sonra kəlmeyi-şəhadət də daxil olmaqla deyilən xüsusi sözlər nəzərdə tutulur.

[2] Sünnə – Muhəmməd Peyğəmbərin ﷺ yoludur. Peyğəmbərin ﷺ yolu deyildikdə onun əməlləri, davranışı, kəlamları, əmrləri və s. nəzərdə tutulur.

[3] Burada iki səcdə arasında və bir də təşəhhüdü oxumaq üçün oturmaq nəzərdə tutulur.

**471.** Əzd Şənuə qəbiləsindən olan – Abdu-Mənaf oğullarının müttəfiqi və Peyğəmbərin ﷺ əshabəsi Abdullah ibn Buheynə ؓ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ onlara zöhr namazını qıldırdı və ilk iki rükətdən sonra oturmadan ayağa qalxdı, camaat da onunla birlikdə ayağa qalxdı. Nəhayət, namazı tamamladıqda və camaat onun salam verməsini gözləyərkən, oturduğu yerdə "Allahu Əkbər" deyib salamdan əvvəl iki dəfə səcdə etdi, sonra da salamları verdi. (əl-Buxari, 829)

## ٣٨- باب: التَّشَهُّدُ فِى الآخِرَةِ

## 38-ci fəsil. Son (rükətdə oxunan) təşəhhüd

**٤٧٢** – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ؓ قَالَ: كُنَّا إِذَا صَلَّيْنَا خَلْفَ النَّبِيِّ ﷺ قُلْنَا: السَّلاَمُ عَلَى اللهِ السَّلاَمُ عَلَى جِبْرِيلَ وَمِيكَائِيلَ، السَّلاَمُ عَلَى فُلاَنٍ وَفُلاَنٍ. فَالْتَفَتَ إِلَيْنَا رَسُولُ اللَّهِ ﷺ فَقَالَ: «إِنَّ اللَّهَ هُوَ السَّلاَمُ، فَإِذَا صَلَّى أَحَدُكُمْ فَلْيَقُلِ التَّحِيَّاتُ لِلَّهِ، وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللَّهِ وَبَرَكَاتُهُ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللَّهِ الصَّالِحِينَ. فَإِنَّكُمْ إِذَا قُلْتُمُوهَا أَصَابَتْ كُلَّ عَبْدٍ لِلَّهِ صَالِحٍ فِى السَّمَاءِ وَالأَرْضِ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ». [رواه البخاري: ٨٣١]

**472.** Abdullah ibn Məsud ؓ rəvayət edir ki, biz Peyğəmbərin ﷺ arxasında namaz qılarkən: "Allaha salam olsun, Cəbrailə və Mikailə salam olsun, filankəsə və filankəsə salam olsun"– deyərdik. (Bir dəfə) Peyğəmbər ﷺ bizə tərəf dönüb buyurdu: "Əslində, Salam[1] Allahın Özüdür. Qoy sizlərdən biri namaz qılanda belə desin: "Salamlar, dualar və gözəl şeylər Allaha məxsusdur. Ey Peyğəmbər, sənə salam olsun, Allahın mərhəməti və Onun bərəkəti (yetişsin)! Bizə və Allahın əməlisaleh qullarına salam olsun![2]" Əgər siz bu sözləri desəniz, bunlar Allahın göylərdə və yerdə olan hər bir əməlisaleh quluna yetişər. (Sonra desin:) "Mən şahidlik edirəm ki, Allahdan başqa məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.[3]" (əl-Buxari, 831)

## ٣٩- باب: الدُّعَاءُ قَبْلَ السَّلاَمِ

## 39-cu fəsil. Salamdan əvvəl dua etmək

**٤٧٣** – عَنْ عَائِشَةَ ؓ: زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَدْعُو فِى الصَّلاَةِ: «اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَحْيَا وَفِتْنَةِ الْمَمَاتِ، اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنَ الْمَأْثَمِ وَالْمَغْرَمِ». فَقَالَ لَهُ قَائِلٌ مَا أَكْثَرَ مَا تَسْتَعِيذُ مِنَ الْمَغْرَمِ فَقَالَ: «إِنَّ الرَّجُلَ إِذَا غَرِمَ حَدَّثَ فَكَذَبَ، وَوَعَدَ فَأَخْلَفَ». [رواه البخاري: ٨٣٢]

---

[1] Salam Allahın adlarından biridir.

[2] Transkripsiyası: Ət-təhiyyətu lilləhi, vəs-səlavatu vət-tayyibat, əs-səlamu aleykə əyyuhən-nəbiyyu və rahmətullahi və bərəkatuhu, əs-səlamu aleynə və alə ibadillahis-salihin.

[3] Transkripsiyası: Əşhədu ən lə ilahə illəllah və əşhədu ənnə Muhəmmədən abduhu və rasuluhu.

**473.** Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها demişdir: "Allahın elçisi ﷺ namaz qılarkən dua edib deyərdi: "Allahım, qəbir əzabından Sənə sığınıram. Məsihi-dəccalın fitnəsindən Sənə sığınıram. Həyatın və ölümün fitnəsindən Sənə sığınıram. Allahım, günahdan və borcdan Sənə sığınıram.[1]"

Bir nəfər ondan soruşdu: "Sən nə üçün tez-tez borcdan ötrü Allaha sığınırsan?" Peyğəmbər ﷺ buyurdu: "Borca girən adam danışanda yalan danışır, söz verəndə sözünün üstündə durmur." (əl-Buxari, 832)

**٤٧٤** – عَنْ أَبِى بَكْرٍ الصِّدِّيقِ رضي الله عنه، أَنَّهُ قَالَ لِرَسُولِ اللَّهِ ﷺ عَلِّمْنِى دُعَاءً أَدْعُو بِهِ فِى صَلاَتِى، قَالَ: «قُلْ اللَّهُمَّ إِنِّى ظَلَمْتُ نَفْسِى ظُلْمًا كَثِيرًا وَلاَ يَغْفِرُ الذُّنُوبَ إِلاَّ أَنْتَ، فَاغْفِرْ لِى مَغْفِرَةً مِنْ عِنْدِكَ، وَارْحَمْنِى إِنَّكَ أَنْتَ الْغَفُورُ الرَّحِيمُ». [رواه البخاري: ٨٣٤]

**474.** Rəvayət edilir ki, (bir dəfə) Əbu Bəkr رضي الله عنه Peyğəmbərə ﷺ: "Mənə namazda edəcəyim bir duanı öyrət"– demiş, o da (cavabında) buyurmuşdur: "De: "Allahım! Mən özümə çoxlu zülm etmişəm. Günahları yalnız Sən bağışlayırsan. Özün günahımdan keçməklə məni bağışla və mənə rəhm et. Həqiqətən, Sən Bağışlayansan, Rəhmlisən![2]" (əl-Buxari, 834)

## 40-cı fəsil. (Axırıncı) təşəhhüddən sonra istənilən duanı etməyin caiz olması

## ٤٠ – باب: مَا يُتَخَيَّرُ مِنَ الدُّعَاءِ بَعْدَ التَّشَهُّدِ

**٤٧٥** – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ رضي الله عنه قَالَ: كُنَّا إِذَا كُنَّا مَعَ النَّبِىِّ ﷺ فِى الصَّلاَةِ قُلْنَا السَّلاَمُ عَلَى اللَّهِ مِنْ عِبَادِهِ، السَّلاَمُ عَلَى فُلاَنٍ وَفُلاَنٍ، فَقَالَ النَّبِىُّ ﷺ: «لاَ تَقُولُوا السَّلاَمُ عَلَى اللَّهِ، فَإِنَّ اللَّهَ هُوَ السَّلاَمُ، وَلَكِنْ قُولُوا التَّحِيَّاتُ لِلَّهِ، وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِىُّ وَرَحْمَةُ اللَّهِ وَبَرَكَاتُهُ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللَّهِ الصَّالِحِينَ، فَإِنَّكُمْ إِذَا قُلْتُمْ أَصَابَ كُلَّ عَبْدٍ فِى السَّمَاءِ أَوْ بَيْنَ السَّمَاءِ وَالأَرْضِ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ، ثُمَّ يَتَخَيَّرُ مِنَ الدُّعَاءِ أَعْجَبَهُ إِلَيْهِ فَيَدْعُو». [رواه البخاري: ٨٣٥]

**475.** Abdullah ibn Məsud رضي الله عنه rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birgə namaz qılarkən: "Allaha qullarından salam olsun, filankəsə və filankəsə salam olsun"– deyərdik. Peyğəmbər ﷺ buyurdu: "Allaha Salam olsun" deməyin. Çünki Salam Allahın Özüdür. Deyin: "Salamlar, dualar və gözəl şeylər Allaha məxsusdur. Ey Peyğəmbər, sənə salam olsun, Allahın mərhəməti və Onun bərəkəti (yetişsin)! Bizə və Allahın əməlisaleh qullarına salam olsun!" Əgər siz bu sözləri desəniz, bunlar göylərdə və ya göylə yer arasında olan hər bir (mömin) bəndəyə çatar. (Sonra deyin:) "Mən şahidlik edirəm ki, Allahdan başqa məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir." Bundan sonra (hər kəs) özünün xoşuna gələn duanı seçib oxuya bilər. (əl-Buxari, 835)

---

[1] Transkripsiyası: Allahummə inni əuzu bikə min əzabil-qabri, və əuzu bikə min fitnətil-məsihid-dəccal, və əuzu bikə min fitnətil-məhyə və fitnətil-məmati. Allahummə inni əuzu bikə minəl-mə'səmi vəl-məğrami.

[2] Transkripsiyası: Allahummə inni zaləmtu nəfsi zulmən kəsiran və lə yəğfiruz-zunubə illə ənt, fəğfir li məğfirətən min indikə vərhəmni, innəkə əntəl-ğafurur-rəhim.

## ٤١- باب: التَّسْلِيمُ

## 41-ci fəsil. Salam

٤٧٦ – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا سَلَّمَ قَامَ النِّسَاءُ حِينَ يَقْضِي تَسْلِيمَهُ، وَمَكَثَ يَسِيرًا قَبْلَ أَنْ يَقُومَ. [رواه البخاري: ٨٣٧]

**476.** Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ (namazı) bitirdikdən sonra qadınlar ayağa qalxardılar, o isə ayağa qalxmamışdan əvvəl bir qədər oturardı. (əl-Buxari, 837)

## ٤٢- باب: يُسَلِّمُ حِينَ يُسَلِّمُ الإِمَامُ

## 42-ci fəsil. Salamlar imam salam verdikdən sonra verilməlidir

٤٧٧ – عَنْ عِتْبَانَ رضي الله عنه قَالَ صَلَّيْنَا مَعَ النَّبِيِّ ﷺ فَسَلَّمْنَا حِينَ سَلَّمَ. [رواه البخاري: ٨٣٨]

**477.** Rəvayət edilir ki, İtban رضي الله عنه demişdir: "Biz Peyğəmbərlə ﷺ birgə namaz qıldıq və o, salam verdikdən sonra biz də salam verdik." (əl-Buxari, 838)

## ٤٣- باب: الذِّكْرُ بَعْدَ الصَّلاَةِ

## 43-cü fəsil. Namazdan sonra zikr etmək

٤٧٨ – عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ رَفْعَ الصَّوْتِ بِالذِّكْرِ حِينَ يَنْصَرِفُ النَّاسُ مِنَ الْمَكْتُوبَةِ كَانَ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ، وَقَالَ ابْنُ عَبَّاسٍ كُنْتُ أَعْلَمُ إِذَا انْصَرَفُوا بِذَلِكَ إِذَا سَمِعْتُهُ. [رواه البخاري: ٨٤١]

**478.** Abdullah ibn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ zamanında camaat fərz namazını bitirdikdən sonra (hamı ayrı-ayrılıqda) yüksək səslə Allahı zikr edərdi. Mən bu zikrləri eşitdikdə namazın başa çatdığını bilirdim. (əl-Buxari, 841)

٤٧٩ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: جَاءَ الْفُقَرَاءُ إِلَى النَّبِيِّ ﷺ فَقَالُوا ذَهَبَ أَهْلُ الدُّثُورِ مِنَ الأَمْوَالِ بِالدَّرَجَاتِ الْعُلاَ وَالنَّعِيمِ الْمُقِيمِ، يُصَلُّونَ كَمَا نُصَلِّي، وَيَصُومُونَ كَمَا نَصُومُ، وَلَهُمْ فَضْلٌ مِنْ أَمْوَالٍ يَحُجُّونَ بِهَا، وَيَعْتَمِرُونَ، وَيُجَاهِدُونَ، وَيَتَصَدَّقُونَ قَالَ: «أَلاَ أُحَدِّثُكُمْ بِأَمْرٍ إِنْ أَخَذْتُمْ بِهِ أَدْرَكْتُمْ مَنْ سَبَقَكُمْ وَلَمْ يُدْرِكْكُمْ أَحَدٌ بَعْدَكُمْ، وَكُنْتُمْ خَيْرَ مَنْ أَنْتُمْ بَيْنَ ظَهْرَانَيْهِ، إِلاَّ مَنْ عَمِلَ مِثْلَهُ تُسَبِّحُونَ وَتَحْمَدُونَ، وَتُكَبِّرُونَ خَلْفَ كُلِّ صَلاَةٍ ثَلاَثًا وَثَلاَثِينَ».
قَالَ الرَاوِي: فَاخْتَلَفْنَا بَيْنَنَا فَقَالَ بَعْضُنَا نُسَبِّحُ ثَلاَثًا وَثَلاَثِينَ، وَنَحْمَدُ ثَلاَثًا وَثَلاَثِينَ، وَنُكَبِّرُ أَرْبَعًا وَثَلاَثِينَ. فَرَجَعْتُ إِلَيْهِ فَقَالَ: «تَقُولُ سُبْحَانَ اللَّهِ، وَالْحَمْدُ لِلَّهِ، وَاللَّهُ أَكْبَرُ، حَتَّى يَكُونَ مِنْهُنَّ كُلِّهِنَّ ثَلاَثًا وَثَلاَثِينَ». [رواه البخاري: ٨٤٣]

**479.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Kasıblar Peyğəmbərin ﷺ yanına gəlib dedilər: "Varlılar ən yüksək məqamlara və tükənməz nemətlərə nail olacaqlar. Onlar bizim kimi namaz qılır və bizim kimi oruc tuturlar, üstəlik onların çoxlu var-dövləti vardır ki, bunun sayəsində həcc və ümrə ziyarətinə gedirlər, (Allah yolunda) cihad edir və sədəqə verirlər." Peyğəmbər ﷺ buyurdu: "Sizə elə bir şey öyrədimmi ki, onu yerinə yetirməklə sizi ötüb keçənlərə çatasınız, sizdən sonra yaşayanlardan heç kəs sizə çata bilməsin və sizin etdiyinizi

edənlər istisna olmaqla, aranızda olan kimsələrin ən xeyirlisi siz olasınız? Hər (vacib) namazdan sonra otuz üç dəfə "subhanəllah", "əlhəmdulilləh" və "Allahu Əkbər" deyin!"

Hədisin ravisi demişdir: "(Bu səbəbdən) bizim aramızda fikir ayrılığı düşdü. Bəzilərimiz dedilər: "Biz otuz üç dəfə "subhanəllah", otuz üç dəfə "əlhəmdulilləh" və otuz dörd dəfə "Allahu Əkbər" deməliyik." Mən (bu haqda Əbu Salehə) sual verdim. O dedi: "Otuz üç dəfə "subhanəllah", *otuz üç dəfə* "əlhəmdulilləh" və *otuz üç dəfə* "Allahu Əkbər" de!" (əl-Buxari, 843)

٤٨٠ – عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَقُولُ فِى دُبُرِ كُلِّ صَلاَةٍ مَكْتُوبَةٍ: «لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ، لَهُ الْمُلْكُ، وَلَهُ الْحَمْدُ، وَهْوَ عَلَى كُلِّ شَىْءٍ قَدِيرٌ، اللَّهُمَّ لاَ مَانِعَ لِمَا أَعْطَيْتَ، وَلاَ مُعْطِىَ لِمَا مَنَعْتَ، وَلاَ يَنْفَعُ ذَا الْجَدِّ مِنْكَ الْجَدُّ». [رواه البخاري: ٨٤٤]

**480.** Muğira ibn Şobə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ hər bir vacib namazdan sonra deyərdi: "Allahdan başqa məbud yoxdur. O, təkdir, Onun şəriki yoxdur. Mülk Onundur və həmd Onadır! O, hər şeyə Qadirdir! Allahım, Sənin (nemət) verdiyinə mane olacaq, mane olduğuna da verəcək (bir kəs) yoxdur. Heç bir hörmət sahibinə Sənin yanında hörməti fayda verməz[1]" (əl-Buxari, 844)

## 44-cü fəsil. İmam salamları verdikdən sonra üzünü camaata tərəf çevirməlidir

## ٤٤ – باب: يَسْتَقْبِلُ الإِمَامُ النَّاسَ إِذَا سَلَّمَ

٤٨١ – عَنْ سَمُرَةَ بْنِ جُنْدَبٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا صَلَّى صَلاَةً أَقْبَلَ عَلَيْنَا بِوَجْهِهِ. [رواه البخاري: ٨٤٥]

**481.** Rəvayət edilir ki, Səmura ibn Cundəb ﷺ demişdir: "Peyğəmbər ﷺ namazı bitirdikdən sonra üzünü bizə tərəf çevirərdi." (əl-Buxari, 845)

٤٨٢ – عَنْ زَيْدِ بْنِ خَالِدٍ الْجُهَنِىِّ ﷺ أَنَّهُ قَالَ: صَلَّى لَنَا رَسُولُ اللَّهِ ﷺ صَلاَةَ الصُّبْحِ بِالْحُدَيْبِيَةِ عَلَى إِثْرِ سَمَاءٍ كَانَتْ مِنَ اللَّيْلَةِ، فَلَمَّا انْصَرَفَ أَقْبَلَ عَلَى النَّاسِ فَقَالَ: «هَلْ تَدْرُونَ مَاذَا قَالَ رَبُّكُمْ؟» قَالُوا اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: «أَصْبَحَ مِنْ عِبَادِى مُؤْمِنٌ بِى وَكَافِرٌ، فَأَمَّا مَنْ قَالَ مُطِرْنَا بِفَضْلِ اللَّهِ وَرَحْمَتِهِ فَذَلِكَ مُؤْمِنٌ بِى وَكَافِرٌ بِالْكَوْكَبِ، وَأَمَّا مَنْ قَالَ بِنَوْءِ كَذَا وَكَذَا فَذَلِكَ كَافِرٌ بِى وَمُؤْمِنٌ بِالْكَوْكَبِ». [رواه البخاري: ٨٤٦]

**482.** Rəvayət edilir ki, Zeyd ibn Xalid əl-Cuhəni ﷺ demişdir: "Peyğəmbər ﷺ Hudeybiyədə gecə ikən yağmış yağışdan sonra bizə sübh namazını qıldırdı və namazı bitirdikdən sonra üzünü camaata çevirib soruşdu: "Bilirsinizmi, Rəbbiniz nə buyurdu?" (Əshabələr:) "Allah və Onun elçisi daha yaxşı bilir"– dedilər. Peyğəmbər ﷺ dedi: "(Allah buyurdu): "Qullarımdan bir qismi mömin, digər qismi isə kafir oldu. "Bizə Allahın lütfü və mərhəməti sayəsində yağış göndərilmişdir"– deyənlərə gəlincə, onlar Mənə iman gətirmiş və ulduzları inkar etmişlər. "Yağış bizə filan və filan ulduza görə nazil olmuşdur"– deyənlərə gəldikdə isə, onlar Mənə küfr etmiş və ulduzlara iman gətirmişlər. (əl-Buxari, 846)

[1] Transkripsiyası: Lə ilahə illəllahu vəhdəhu lə şərikə ləh, ləhul-mulku və ləhul-həmdu və huvə alə kulli şeyin qadir, Allahummə, lə maniə limə ə'taytə və lə mu'tiyə limə mənə'tə və lə yənfəu zəl-cəddi minkəl-cədd.

## ٤٥– باب: مَنْ صَلَّى بِالنَّاسِ فَذَكَرَ حَاجَةً فَتَخَطَّاهُمْ

## 45-ci fəsil. Camaata namaz qıldırdıqdan sonra vacib bir işi yadına salaraq cərgələrin arasından keçib gedən kimsə haqqında

٤٨٣ – عَنْ عُقْبَةَ ﷺ قَالَ: صَلَّيْتُ وَرَاءَ النَّبِيِّ ﷺ بِالْمَدِينَةِ الْعَصْرَ فَسَلَّمَ ثُمَّ قَامَ مُسْرِعًا، فَتَخَطَّى رِقَابَ النَّاسِ إِلَى بَعْضِ حُجَرِ نِسَائِهِ، فَفَزِعَ النَّاسُ مِنْ سُرْعَتِهِ فَخَرَجَ عَلَيْهِمْ، فَرَأَى أَنَّهُمْ عَجِبُوا مِنْ سُرْعَتِهِ فَقَالَ: «ذَكَرْتُ شَيْئًا مِنْ تِبْرٍ عِنْدَنَا فَكَرِهْتُ أَنْ يَحْبِسَنِي، فَأَمَرْتُ بِقِسْمَتِهِ». [رواه البخاري: ٨٥١]

**483.** Rəvayət edilir ki, Uqbə ﷺ demişdir: "Mən Mədinədə Peyğəmbərin ﷺ arxasında durub əsr namazını qıldım. O, salamları verdikdən sonra dərhal ayağa qalxıb camaatın başı üstündən keçib zövcələrindən birinin hücrəsinə getdi. Camaat onun belə tələsik çıxıb getməsindən təşvişə düşdü. Peyğəmbər ﷺ bayıra çıxdıqda onların təəccübləndiyini görüb dedi: "Evimizdə olan qızılı xatırladım və istəmədim ki, o, mənim diqqətimi yayındırsın. Buna görə də onun bölüşdürülüb paylanmasını əmr etdim." (əl-Buxari, 851)

## ٤٦– باب: الاِنْصِرَافُ عَنِ الْيَمِينِ وَالشِّمَالِ

## 46-cı fəsil. (Namazı qılıb qurtardıqdan sonra) sağ və ya sol tərəfə dönüb getmək

٤٨٤ – عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: لاَ يَجْعَلْ أَحَدُكُمْ لِلشَّيْطَانِ شَيْئًا مِنْ صَلاَتِهِ، يَرَى أَنَّ حَقًّا عَلَيْهِ أَنْ لاَ يَنْصَرِفَ إِلاَّ عَنْ يَمِينِهِ، لَقَدْ رَأَيْتُ النَّبِيَّ ﷺ كَثِيرًا يَنْصَرِفُ عَنْ يَسَارِهِ. [رواه البخاري: ٨٥٢]

**484.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Qoy sizlərdən biri "(namaz qıldığı yerdən) qalxıb ancaq sağ tərəfə getmək lazımdır" deyə etiqad edib namazından şeytana bir pay ayırmasın. Mən çox vaxt Peyğəmbərin ﷺ qalxıb sol tərəfə qalxıb getdiyini görmüşəm." (əl-Buxari, 852)

## ٤٧– باب: مَا جَاءَ فِي الثُّومِ النِّيِّ وَالْبَصَلِ وَالْكُرَّاثِ

## 47-ci fəsil. Çiy sarımsaq, soğan və kəvər haqqında deyilənlər

٤٨٥ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «مَنْ أَكَلَ مِنْ هَذِهِ الشَّجَرَةِ – يُرِيدُ الثُّومَ – فَلاَ يَغْشَانَا فِي مَسَاجِدِنَا». قَالَ الرَّاوِي: قُلْتُ لِجَابِرٍ: مَا يَعْنِي بِهِ؟ قَالَ: مَا أُرَاهُ يَعْنِي إِلاَّ نِيئَهُ، وَ قِيلَ: إِلاَّ نَتْنَهُ. [رواه البخاري: ٨٥٤]

**485.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ, – sarımsağı qəsd edərək – buyurmuşdur: "Qoy bu bitkini yeyənlər məscidlərimizə gəlməsinlər."

Bu hədisin ravisi demişdir: "Mən Cabirdən ﷺ soruşdum: "Bunu deməklə o, nəyi qəsd edirdi?" O dedi: "Düşünürəm ki, o, çiy sarımsağı qəsd edirdi."

Digər rəvayətdə isə deyilir: "... onun üfunətli qoxusunu qəsd edirdi." (əl-Buxari, 854)

٤٨٦ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «مَنْ أَكَلَ ثُومًا أَوْ بَصَلاً فَلْيَعْتَزِلْنَا أَوْ قَالَ فَلْيَعْتَزِلْ مَسْجِدَنَا، وَلْيَقْعُدْ فِى بَيْتِه». وَأَنَّ النَّبِىَّ ﷺ أُتِىَ بِقِدْرٍ فِيهِ خَضِرَاتٌ مِنْ بُقُولٍ، فَوَجَدَ لَهَا رِيحًا فَسَأَلَ فَأُخْبِرَ بِمَا فِيهَا مِنَ الْبُقُولِ فَقَالَ: «قَرِّبُوهَا» إِلَى بَعْضِ أَصْحَابِهِ كَانَ مَعَهُ، فَلَمَّا رَآهُ كَرِهَ أَكْلَهَا قَالَ: «كُلْ فَإِنِّى أُنَاجِى مَنْ لاَ تُنَاجِى». [رواه البخاري: ٨٥٥]

**486.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qoy sarımsaq və ya soğan yeyən adam bizdən uzaq dursun və ya məscidimizdən uzaqlaşsın və evində otursun!"

(Cabir ﷺ deyir ki:) "Bir dəfə Peyğəmbərə ﷺ bir qab təzə tərəvəz gətirdilər. Peyğəmbər ﷺ tərəvəzin (xoşagəlməz) qoxusunu duyub (onun nə olduğunu) soruşdu. Qabda olan tərəvəzlərin (adlarını) ona dedilər. O da yanında duran əshabələrdən birini göstərib: "Bunu ona verin"– deyə buyurdu. Əshabə (onun yemədiyini) görəndə bu tərəvəzdən yemək istəmədi. Onda o buyurdu: "Ye, (mənə baxma), çünki mən sənin söhbət edə bilmədiyin (mələklərlə) gizli söhbət aparıram." (əl-Buxari, 855)

٤٨٧ – وَ فِي رِوَايَةٍ: أُتِىَ بِبَدْرٍ، يَعْنِى طَبَقًا، فِيهِ خَضِرَاتٌ مِنْ بُقُولٍ. [رواه البخاري: ٧٣٥٩]

**487.** Digər rəvayətdə deyilir ki: "... bir qazan tərəvəz gətirdilər." (əl-Buxari, 7359)

## 48-ci fəsil. Uşaqların dəstəmaz alması

## ٤٨– باب: وُضُوءُ الصِّبْيَانِ

٤٨٨ – عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ رضي الله عنهما، أَنَّ النَّبِيَّ ﷺ مَرَّ عَلَى قَبْرٍ مَنْبُوذٍ، فَأَمَّهُمْ وَصَفُّوا عَلَيْهِ. [رواه البخاري: ٨٥٧]

**488.** Abdullah ibn Abbas ﷺ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ (məzarlıqda) kənarda qalmış bir qəbrin yanında dayanıb əshabələrinə namaz qıldırdı və onlar da onun arxasında cərgəbəcərgə namaza durdular. (əl-Buxari, 857)

٤٨٩ – عَنْ أَبِي سَعِيدٍ الخُدْرِيِّ رضي الله عنه، أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «الْغُسْلُ يَوْمَ الْجُمُعَةِ وَاجِبٌ عَلَى كُلِّ مُحْتَلِمٍ». [رواه البخاري: ٨٥٨]

**489.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cümə qüslünü etmək həddi-buluğa çatmış hər kəsə vacibdir." (əl-Buxari, 858)

٤٩٠ – عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ رضي الله عنهما، قَالَ لَهُ رَجُلٌ: شَهِدْتَ الْخُرُوجَ مَعَ رَسُولِ اللَّهِ ﷺ؟ قَالَ نَعَمْ، وَلَوْلاَ مَكَانِى مِنْهُ مَا شَهِدْتُهُ يَعْنِى مِنْ صِغَرِه، أَتَى الْعَلَمَ الَّذِى عِنْدَ دَارِ كَثِيرِ بْنِ الصَّلْتِ، ثُمَّ خَطَبَ ثُمَّ أَتَى النِّسَاءَ فَوَعَظَهُنَّ وَذَكَّرَهُنَّ وَأَمَرَهُنَّ أَنْ يَتَصَدَّقْنَ فَجَعَلَتِ الْمَرْأَةُ تُهْوِى بِيَدِهَا إِلَى حَلْقِهَا تُلْقِى فِى ثَوْبِ بِلاَلٍ، ثُمَّ أَتَى هُوَ وَبِلاَلٌ الْبَيْتَ. [رواه البخاري: ٨٦٣]

**490.** Rəvayət edilir ki, bir nəfər Abdullah ibn Abbasdan ﷺ soruşdu: "Sən Peyğəmbərlə ﷺ birlikdə bayram namazında iştirak etmisənmi?" O dedi: "Bəli! Əgər mən ona qohum olmasaydım, (uşaq vaxtımdan) onun yanında ola bilməzdim. Peyğəmbər ﷺ Kəsir ibn Səltin evinin yanındakı namazgaha yaxınlaşıb xütbə oxudu, sonra qadınların yanına gəlib onlara öyüd-nəsihət verdi, onlara (bəzi

şeyləri) xatırlatdı və onlara sədəqə verməyi əmr etdi. Bundan sonra qadınlar əllərini boyunlarına apararaq (boyunbağılarını çıxardıb) onları Bilalın paltarının ətəyinə atmağa başladılar. Sonra Peyğəmbər ﷺ Bilalla birlikdə evinə qayıtdı". (əl-Buxari, 863)

## ٤٩- باب: خُرُوجُ النِّسَاءِ إِلَى الْمَسَاجِدِ بِاللَّيْلِ وَالْغَلَسِ

## 49-cu fəsil. Gecə və ala-qaranlıqda qadınların məscidə getməsi

**٤٩١** – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا اسْتَأْذَنَكُمْ نِسَاؤُكُمْ بِاللَّيْلِ إِلَى الْمَسْجِدِ فَأْذَنُوا لَهُنَّ». [رواه البخاري: ٨٦٥]

**491.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər demişdir: "Qadınlarınız sizdən gecə vaxtı məscidə getməyə izn istəsələr, onlara izn verin." (əl-Buxari, 865)

# ١١ – كِتَابُ الجُمُعَةِ

# 11 – Cümə kitabı

## ١– باب: فَرْضُ الْجُمُعَةِ

## 1-ci fəsil. Cümənin fərz olması

٤٩٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «نَحْنُ الآخِرُونَ السَّابِقُونَ يَوْمَ الْقِيَامَةِ، بَيْدَ أَنَّهُمْ أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِنَا، ثُمَّ هَذَا يَوْمُهُمُ الَّذِى فُرِضَ عَلَيْهِمْ فَاخْتَلَفُوا فِيهِ، فَهَدَانَا اللَّهُ، فَالنَّاسُ لَنَا فِيهِ تَبَعٌ، الْيَهُودُ غَدًا وَالنَّصَارَى بَعْدَ غَدٍ». [رواه البخاري: ٨٧٦]

**492.** Əbu Hureyra ﷺ rəvayət edir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Hərçənd onlara[1] bizdən əvvəl Kitab verilmişdir, lakin biz sonuncular[2] Qiyamət günü birinci[3] olacağıq. Onlar özlərinə fərz buyrulmuş bu günləri barəsində ixtilafa düşdülər[4]. Lakin Allah bizi (bu günü ehtiramla keçirməyə) müvəffəq etdi və bu xüsusda insanlar bizim ardımızca gəldilər, yəhudilər sabahkı günü[5], xristianlar isə ondan sonrakı günü[6] (təntənə ilə qeyd edirlər)." (əl-Buxari, 876)

## ٢– باب: الطِّيبُ لِلْجُمُعَةِ

## 2-ci fəsil. Cümə namazı üçün ətirlənmək

٤٩٣ – عَنْ أَبِى سَعِيد الخُدْرِيِّ ﷺ قَالَ: أَشْهَدُ عَلَى رَسُولِ اللَّهِ ﷺ قَالَ: «الْغُسْلُ يَوْمَ الْجُمُعَةِ وَاجِبٌ عَلَى كُلِّ مُحْتَلِمٍ، وَأَنْ يَسْتَنَّ وَأَنْ يَمَسَّ طِيبًا إِنْ وَجَدَ». [رواه البخاري: ٨٨٠]

**493.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Mən şahidlik edirəm ki, Peyğəmbər ﷺ demişdir: "Cümə qüslünü almaq həddi-buluğa çatmış hər kəsə vacibdir. Həmçinin, imkan daxilində dişlərini misvakla təmizləməli və ətirdən istifadə etməlidir." (əl-Buxari, 880)

## ٣– باب: فَضْلُ الْجُمُعَةِ

## 3-cü fəsil. Cümə namazının fəziləti

٤٩٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَنِ اغْتَسَلَ يَوْمَ الْجُمُعَةِ غُسْلَ الْجَنَابَةِ ثُمَّ رَاحَ فَكَأَنَّمَا قَرَّبَ بَدَنَةً، وَمَنْ رَاحَ فِى السَّاعَةِ الثَّانِيَةِ فَكَأَنَّمَا قَرَّبَ بَقَرَةً، وَمَنْ رَاحَ فِى السَّاعَةِ الثَّالِثَةِ فَكَأَنَّمَا قَرَّبَ كَبْشًا أَقْرَنَ، وَمَنْ رَاحَ فِى السَّاعَةِ الرَّابِعَةِ فَكَأَنَّمَا قَرَّبَ دَجَاجَةً، وَمَنْ رَاحَ فِى السَّاعَةِ الْخَامِسَةِ فَكَأَنَّمَا قَرَّبَ بَيْضَةً، فَإِذَا خَرَجَ الإِمَامُ حَضَرَتِ الْمَلاَئِكَةُ يَسْتَمِعُونَ الذِّكْرَ». [رواه البخاري: ٨٨١]

---

[1] Burada yəhudilər və xristianlar nəzərdə tutulur.

[2] Yəni zəmanəyə görə sonuncu ümmətik.

[3] Axirətdə bu ümmətin hamıdan əvvəl Sirat körpüsündən keçib Cənnətə daxil olacağı qəsd edilir.

[4] Allah Kitab əhlinə cümə gününü ehtiramla keçirməyi vacib buyurmuş, onlar isə bu xüsusda fikir ayrılığına düşüb asi olmuşlar.

[5] Yəni şənbə gününü.

[6] Yəni bazar gününü.

**494.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənabət qüslü kimi qüsl edib cümə gününün ilk saatında məscidə gedən adam bir dəvə, ikinci saatında gedən adam bir inək, üçüncü saatında gedən adam buynuzlu bir qoç, dördüncü saatında gedən adam bir toyuq və beşinci saatında gedən adam bir yumurta qurban vermiş kimidir. İmam (minbərə) qalxdıqda isə mələklər gəlib zikr olunanları dinləyər.[1]" (əl-Buxari, 881)

## 4-cü fəsil. Cümə günü saçların yağlanması

## ٤ – باب: الدُّهْنُ لِلْجُمُعَةِ

٤٩٥ – عَنْ سَلْمَانَ الْفَارِسِيِّ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «لاَ يَغْتَسِلُ رَجُلٌ يَوْمَ الْجُمُعَةِ، وَيَتَطَهَّرُ مَا اسْتَطَاعَ مِنْ طُهْرٍ، وَيَدَّهِنُ مِنْ دُهْنِهِ، أَوْ يَمَسُّ مِنْ طِيبِ بَيْتِهِ ثُمَّ يَخْرُجُ، فَلاَ يُفَرِّقُ بَيْنَ اثْنَيْنِ، ثُمَّ يُصَلِّى مَا كُتِبَ لَهُ، ثُمَّ يُنْصِتُ إِذَا تَكَلَّمَ الإِمَامُ، إِلاَّ غُفِرَ لَهُ مَا بَيْنَهُ وَبَيْنَ الْجُمُعَةِ الأُخْرَى». [رواه البخاري: ٨٨٣]

**495.** Salman Farisi ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim cümə günü qüsl edib bacardığı qədər təmizlənər, (saçlarını) yağlayar və ya evində olan ətirlə ətirlənər, sonra (cümə namazına) gedər və camaatın başının üstündən keçmədən (bir tərəfə çəkilib Allahın) ona buyurduğu namazı qılar və bundan sonra imam xütbə verərkən susub dinləyərsə, həmin cümə ilə ötən cümə arasında olan (kiçik günahları) bağışlanar." (əl-Buxari, 883)

٤٩٦ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّهُ قِيلَ لَهُ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «اغْتَسِلُوا يَوْمَ الْجُمُعَةِ وَاغْسِلُوا رُءُوسَكُمْ وَإِنْ لَمْ تَكُونُوا جُنُبًا، وَأَصِيبُوا مِنَ الطِّيبِ» . قَالَ ابْنُ عَبَّاسٍ: أَمَّا الْغُسْلُ فَنَعَمْ، وَأَمَّا الطِّيبُ فَلاَ أَدْرِى. [رواه البخاري: ٨٨٤]

**496.** Rəvayət edirlər ki, ibn Abbasa ﷺ dedilər: "Peyğəmbər ﷺ buyurmuşdur: "Cümə günü, cunub olmasanız belə qüsl edin, başınızı yuyun və ətirlənin." İbn Abbas dedi: "O ki qaldı qüsl etməyə, bəli (elədir), ətir barəsində isə (heç nə) bilmirəm." (əl-Buxari, 884)

## 5-ci fəsil. (Cümə namazına) hər kəs özünün ən gözəl geyimini geyməlidir

## ٥ – باب: يَلْبَسُ أَحْسَنَ مَا يَجِدُ

٤٩٧ – عَنْ عُمَرَ بْنَ الْخَطَّابِ ﷺ أَنَّهُ رَأَى حُلَّةَ سِيَرَاءَ عِنْدَ بَابِ الْمَسْجِدِ فَقَالَ يَا رَسُولَ اللَّهِ، لَوِ اشْتَرَيْتَ هَذِهِ فَلَبِسْتَهَا يَوْمَ الْجُمُعَةِ وَلِلْوَفْدِ إِذَا قَدِمُوا عَلَيْكَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّمَا يَلْبَسُ هَذِهِ مَنْ لاَ خَلاَقَ لَهُ فِى الآخِرَةِ». ثُمَّ جَاءَتْ رَسُولَ اللَّهِ ﷺ مِنْهَا حُلَلٌ، فَأَعْطَى عُمَرَ بْنَ الْخَطَّابِ ﷺ مِنْهَا حُلَّةً فَقَالَ عُمَرُ يَا رَسُولَ اللَّهِ ، كَسَوْتَنِيهَا وَقَدْ قُلْتَ فِى حُلَّةِ عُطَارِدٍ مَا قُلْتَ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنِّى لَمْ أَكْسُكَهَا لِتَلْبَسَهَا». فَكَسَاهَا عُمَرُ بْنُ الْخَطَّابِ ﷺ أَخًا لَهُ بِمَكَّةَ مُشْرِكًا. [رواه البخاري: ٨٨٦]

**497.** Rəvayət edilir ki, (bir dəfə) Ömər ibn Xattab ﷺ məscidin qapısının yanında (satılan) ipək paltarı görüb dedi: "Ey Allahın elçisi! Yaxşı olar ki, bu paltarı alasan və onu həm cümə günləri, həm də yanına nümayəndələr gələndə geyəsən."

[1] Yəni bundan sonra cüməyə yetişənləri siyahıya almazlar.

Peyğəmbər ﷺ buyurdu: "Bu paltarı axirətdə heç bir payı olmayan kimsə geyər!" Sonralar Peyğəmbərə ﷺ belə ipək paltarlar gətirdilər və o, bunlardan birini Ömər ibn Xattaba verdi. Ömər dedi: "Ey Allahın elçisi! Sən mənə bu paltarı verdin, halbuki özün Utaridin (gətirdiyi) paltarlar haqqında dediyini demişdin!" Peyğəmbər ﷺ buyurdu: "Mən bunu sənə ona görə vermədim ki, sən onu geyəsən." Belə olduqda, Ömər ibn Xattab onu Məkkədə yaşayan müşrik qardaşına verdi. (əl-Buxari, 886)

## 6-cı fəsil. Cümə günü misvakdan istifadə etmək

## ٦– باب: السِّوَاكُ يَوْمَ الْجُمُعَةِ

٤٩٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لَوْلاَ أَنْ أَشُقَّ عَلَى أُمَّتِي – أَوْ عَلَى النَّاسِ – لأَمَرْتُهُمْ بِالسِّوَاكِ مَعَ كُلِّ صَلاَةٍ». [رواه البخاري: ٨٨٧]

**498.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əgər ümmətimə (və ya insanlara) ağır gəlməsəydi, onlara əmr edərdim ki, hər namazdan əvvəl (dişlərini) misvakla təmizləsinlər." (əl-Buxari, 887)

٤٩٩ – عَنْ أَنَسٍ ﷺ قَالَ، قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَكْثَرْتُ عَلَيْكُمْ فِي السِّوَاكِ». [رواه البخاري: ٨٨٨]

**499.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən misvaka dair sizə dəfələrlə nəsihət etmişəm." (əl-Buxari, 888)

## 7-ci fəsil. Cümə günü sübh namazında oxunan surələr haqqında

## ٧– باب: مَا يُقْرَأُ فِي صَلاَةِ الْفَجْرِ يَوْمَ الْجُمُعَةِ

٥٠٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ كَانَ النَّبِيُّ ﷺ يَقْرَأُ فِي الْجُمُعَةِ فِي صَلاَةِ الْفَجْرِ ﴿الٓمٓ تَنزِيلُ﴾ السَّجْدَةَ وَ ﴿هَلۡ أَتَىٰ عَلَى ٱلۡإِنسَٰنِ﴾ [رواه البخاري: ٨٩١]

**500.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ cümə günləri sübh namazında **"Əlif. Ləm. Mim. Şübhə yoxdur ki, bu Kitabı aləmlərin Rəbbi *olan Allah* nazil etmişdir"**[1] və **"Doğrudanmı, insanın heç kimə məlum olmadığı bir dövr hələ də ötüb keçməmişdir?"**[2] surələrini oxuyardı. (əl-Buxari, 891

## 8-ci fəsil. Kəndlər və şəhərlərdə cümə namazının qılınması

## ٨– باب: الْجُمُعَةُ فِي الْقُرَى وَالْمُدُنِ

٥٠١ – عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «كُلُّكُمْ رَاعٍ، وَكُلُّكُمْ مَسْئُولٌ عَنْ رَعِيَّتِهِ، الإِمَامُ رَاعٍ وَمَسْئُولٌ عَنْ رَعِيَّتِهِ، وَالرَّجُلُ رَاعٍ فِي أَهْلِهِ وَهُوَ مَسْئُولٌ عَنْ رَعِيَّتِهِ، وَالْمَرْأَةُ رَاعِيَةٌ فِي بَيْتِ زَوْجِهَا وَمَسْئُولَةٌ عَنْ

[1] "əs-Səcdə" surəsi.
[2] "əl-İnsan" surəsi.

رَعِيَّتِهَا، وَالْخَادِمُ رَاعٍ فِى مَالِ سَيِّدِهِ وَمَسْئُولٌ عَنْ رَعِيَّتِهِ - قَالَ وَحَسِبْتُ أَنْ قَدْ قَالَ - وَالرَّجُلُ رَاعٍ فِى مَالِ أَبِيهِ وَمَسْئُولٌ عَنْ رَعِيَّتِهِ وَكُلُّكُمْ رَاعٍ وَمَسْئُولٌ عَنْ رَعِيَّتِهِ» [رواه البخاري: ٨٩٣]

**501.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Hər biriniz himayəçisiniz və hər biriniz himayəsində olanlara cavabdehdir. Əmir himayədardır və o, öz rəiyyətinə cavabdehdir. Kişi öz ailəsinin hamisidir və o, öz himayəsində olanlara cavabdehdir. Qadın ərinin evinə nəzarət edəndir və o, öz nəzarətində olanlara cavabdehdir. Xidmətçi ağasının malına nəzarət edəndir və o, buna cavabdehdir.[1] Hər biriniz himayəçisiniz və hər biriniz himayəsində olanlara cavabdehdir." (əl-Buxari, 893)

### 9-cu fəsil. Özlərinə cümə namazı qılmaq vacib olmayanlara cümə qüslünü etmək vacibdirmi?

### ٩- باب: هَلْ يَجِبُ غُسْلُ الْجُمُعَةِ عَلَى مَنْ لا تَجِبُ عَلَيْهِ

٥٠٢ - عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «نَحْنُ الآخِرُونَ السَّابِقُونَ يَوْمَ الْقِيَامَةِ، أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِنَا، وَأُوتِينَاهُ مِنْ بَعْدِهِمْ، فَهَذَا الْيَوْمُ الَّذِى اخْتَلَفُوا فِيهِ فَهَدَانَا اللَّهُ، فَغَدًا لِلْيَهُودِ وَبَعْدَ غَدٍ لِلنَّصَارَى»، ثُمَّ قَالَ: «حَقٌّ عَلَى كُلِّ مُسْلِمٍ أَنْ يَغْتَسِلَ فِى كُلِّ سَبْعَةِ أَيَّامٍ يَوْمًا يَغْسِلُ فِيهِ رَأْسَهُ وَجَسَدَهُ». [رواه البخاري: ٨٩٦-٨٩٧]

**502.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biz sonuncular Qiyamət günü birinci olacağıq. Halbuki kitab onlara bizdən əvvəl, bizə isə onlardan sonra verilmişdir. Bu, onların, barəsində ixtilaf etdiyi gündür. Allah bizi (bu günü ehtiramla keçirməyə) müvəffəq etdi, yəhudilər sabahkı günü[2], xristianlar isə ondan sonrakı günü[3] (təntənə ilə qeyd edirlər)." O, (bir qədər susduqdan) sonra dedi: "Hər bir müsəlman həftədə bir dəfə qüsl etməli – başını və bədənini yumalıdır." (əl-Buxari, 896-897)

### 10-cu fəsil. Cümə namazına haradan və kimlər gəlməlidir?

### ١٠- باب: مِنْ أَيْنَ تُؤْتَى الْجُمُعَةُ وَعَلَى مَنْ تَجِبُ

٥٠٣ - عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كَانَ النَّاسُ يَنْتَابُونَ يَوْمَ الْجُمُعَةِ مِنْ مَنَازِلِهِمْ وَالْعَوَالِى، فَيَأْتُونَ فِى الْغُبَارِ، يُصِيبُهُمُ الْغُبَارُ وَالْعَرَقُ، فَيَخْرُجُ مِنْهُمُ الْعَرَقُ، فَأَتَى رَسُولَ اللَّهِ ﷺ إِنْسَانٌ مِنْهُمْ وَهُوَ عِنْدِى، فَقَالَ النَّبِىُّ ﷺ: «لَوْ أَنَّكُمْ تَطَهَّرْتُمْ لِيَوْمِكُمْ هَذَا». [رواه البخاري: ٩٠٢]

**503.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Cümə günü camaat (namaza) öz evlərindən və Əvalidən[4] növbə ilə gələrdi. Onlar toz-torpağa bulaşmış və qan-tərə batmış halda (məscidə) gələrdilər, bədənlərindən də (həmişə) tər axardı. Pey-

[1] Hədisi rəvayət edən ravi demişdir: "Deyəsən, ibn Ömər رضي الله عنهما: "...kişi atasının malına nəzarət edəndir və o, buna cavabdehdir"- demişdir.

[2] Yəni şənbə gününü.

[3] Yəni bazar gününü.

[4] 339-cu hədisin qeydlərinə bax.

ğəmbər ﷺ mənim yanımda ikən onlardan biri onun yanına gəldi və Peyğəmbər ﷺ buyurdu: “Nə olaydı ki, siz bu gününüz üçün yuyunardınız.” (əl-Buxari, 902)

٥٠٤ – عَنْهَا رضي الله عنها قَالَتْ: كَانَ النَّاسُ مَهَنَةَ أَنْفُسِهِمْ، وَكَانُوا إِذَا رَاحُوا إِلَى الْجُمُعَةِ رَاحُوا فِي هَيْئَتِهِمْ فَقِيلَ لَهُمْ لَوِ اغْتَسَلْتُمْ. [رواه البخاري: ٩٠٣]

**504.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “(O zaman) insanlar öz işlərində çalışar və cümə namazına gələndə işçi görkəmində gələrdilər. Belə olduqda, onlara: “Nə olaydı ki, siz yuyunaydınız”– deyildi. (əl-Buxari, 903)

٥٠٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه أَنَّ النَّبِيَّ ﷺ كَانَ يُصَلِّي الْجُمُعَةَ حِينَ تَمِيلُ الشَّمْسُ. [رواه البخاري: ٩٠٤]

**505.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ cümə namazını gün batmağa meyl etdiyi vaxt qılardı. (əl-Buxari, 904)

## 11-ci fəsil. Cümə günü həddən artıq isti olduqda (nə etmək lazımdır)

## ١١ – باب: إِذَا اشْتَدَّ الْحَرُّ يَوْمَ الْجُمُعَةِ

٥٠٦ – عَنْهُ رضي الله عنه قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا اشْتَدَّ الْبَرْدُ بَكَّرَ بِالصَّلاَةِ، وَإِذَا اشْتَدَّ الْحَرُّ أَبْرَدَ بِالصَّلاَةِ، يَعْنِي الْجُمُعَةَ. [رواه البخاري: ٩٠٦]

**506.** Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه demişdir: “Hava çox soyuq olduqda Peyğəmbər ﷺ cümə namazını erkən[1] qılar, hava bərk istiləşdikdə isə sərin düşənədək namazı təxirə salardı. (əl-Buxari, 906)

## 12-ci fəsil. Cümə namazına getmək

## ١٢ – باب: الْمَشْيُ إِلَى الْجُمُعَةِ

٥٠٧ – عَنْ أَبِي عَبْسٍ رضي الله عنه قَالَ، هُوَ ذَاهِبٌ إِلَى الْجُمُعَةِ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «مَنِ اغْبَرَّتْ قَدَمَاهُ فِي سَبِيلِ اللَّهِ حَرَّمَهُ اللَّهُ عَلَى النَّارِ». [رواه البخاري: ٩٠٧]

**507.** Rəvayət edilir ki, Əbu Əbs رضي الله عنه cümə namazına gedərkən demişdir: “Mən Peyğəmbərin ﷺ: “Kimin ayaqları Allah yolunda toz-torpağa bulaşarsa, Allah ona Cəhənnəm odunu haram edər”– dediyini eşitmişəm.” (əl-Buxari, 907)

## 13-cü fəsil. Adam cümə günü qardaşını durğuzub onun yerində oturmamalıdır

## ١٣ – باب: لاَ يُقِيمُ الرَّجُلُ أَخَاهُ يَوْمَ الْجُمُعَةِ وَيَقْعُدُ فِي مَكَانِهِ

٥٠٨ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ يُقِيمَ الرَّجُلُ أَخَاهُ مِنْ مَقْعَدِهِ وَيَجْلِسَ فِيهِ، قِيلَ: الْجُمُعَةَ؟ قَالَ الْجُمُعَةَ وَغَيْرَهَا. [رواه البخاري: ٩١١]

[1] Burada erkən deyildikdə namazı ilk vaxtında qılmaq nəzərdə tutulur.

**508.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ (məsciddə olan hər) kəsə qardaşını durğuzub onun yerində oturmağı qadağan etmişdir." Ondan soruşdular: "Cümə namazınımı (qəsd edirdi)?" O: "İstər cümə namazı, istərsə də başqa namaz olsun"– deyə cavab verdi.(əl-Buxari, 911)

## 14-cü fəsil. Cümə günü azan vermək

## ١٤– باب: الأَذَانُ يَوْمَ الْجُمُعَةِ

٥٠٩ – عَنْ السَّائِبِ بْنِ يَزِيدَ ﷺ قَالَ: كَانَ النِّدَاءُ يَوْمَ الْجُمُعَةِ أَوَّلُهُ إِذَا جَلَسَ الإِمَامُ عَلَى الْمِنْبَرِ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ وَأَبِى بَكْرٍ وَعُمَرَ ﷺ فَلَمَّا كَانَ عُثْمَانُ ﷺ وَكَثُرَ النَّاسُ زَادَ النِّدَاءَ الثَّالِثَ عَلَى الزَّوْرَاءِ. [رواه البخاري: ٩١٢]

**509.** Rəvayət edilir ki, Saib ibn Yezid ﷺ demişdir: "Peyğəmbərin ﷺ, Əbu Bəkrin və Ömərin yaşadıqları dövrdə cümə namazının azanı imam minbərdə oturduğu zaman oxunardı. Osman (xəlifə) olduqda və camaatın sayı artdıqda, o, Zəurada[1] verilən üçüncü azanı[2] əlavə etdi." (əl-Buxari, 912)

## 15-ci fəsil. Cümə günü bir müəzzinin (olması haqqında)

## ١٥– باب: الْمُؤَذِّنُ الْوَاحِدُ يَوْمَ الْجُمُعَةِ

٥١٠ – عَنْهُ ﷺ قَالَ: لَمْ يَكُنْ لِلنَّبِيِّ ﷺ مُؤَذِّنٌ غَيْرَ وَاحِدٍ، وَكَانَ التَّأْذِينُ يَوْمَ الْجُمُعَةِ حِينَ يَجْلِسُ الإِمَامُ، يَعْنِى عَلَى الْمِنْبَرِ. [رواه البخاري: ٩١٣]

**510.** Rəvayət edilir ki, Saib ibn Yezid ﷺ demidir: "Peyğəmbərin ﷺ ancaq bir müəzzini vardı və cümə günü azan imam minbərdə oturanda verilərdi." (əl-Buxari, 913)

## 16-cı fəsil. Cümə günü minbərdə (oturmuş imam) azanın sözlərini təkrar etməlidir

## ١٦– باب: يَجِبُ الأَذَانُ عَلَى الْمِنْبَرِ يَوْمَ الْجُمُعَةِ

٥١١ – عَنْ مُعَاوِيَةَ بْنِ أَبِى سُفْيَانَ ﷺ، أَنَّهُ جَلَسَ عَلَى الْمِنْبَرِ يَوْمَ الْجُمُعَةِ، فَلَمَّا أَذَّنَ الْمُؤَذِّنُ قَالَ اللَّهُ أَكْبَرُ اللَّهُ أَكْبَرُ، قَالَ مُعَاوِيَةُ ﷺ اللَّهُ أَكْبَرُ اللَّهُ أَكْبَرُ. قَالَ أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، فَقَالَ مُعَاوِيَةُ ﷺ وَأَنَا، فَقَالَ أَشْهَدُ أَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ، فَقَالَ مُعَاوِيَةُ وَأَنَا، فَلَمَّا أَنْ قَضَى التَّأْذِينَ قَالَ: يَا أَيُّهَا النَّاسُ إِنِّى سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ عَلَى هَذَا الْمَجْلِسِ حِينَ أَذَّنَ الْمُؤَذِّنُ يَقُولُ مَا سَمِعْتُمْ مِنِّى مِنْ مَقَالَتِى. [رواه البخاري: ٩١٤]

**511.** Rəvayət edilir ki, Müaviyə ibn Əbu Süfyan ﷺ cümə günü minbərdə oturmuş və müəzzin azan verib: "Allahu Əkbər, Allahu Əkbər"– dedikdə, Müaviyə: "Allahu Əkbər, Allahu Əkbər"– demişdir; (müəzzin): "Mən şahidlik edirəm ki,

---

[1] Mədinə bazarında bir yer adıdır.

[2] Burada üçüncü azan deyildikdə cümə namazından xeyli əvvəl verilən azan nəzərdə tutulur. Cümə namazı üçün verilən azan və iqamə - iki azan adlandırıldığından ravi bunu üçüncü azan hesab etmişdir.

Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur"[1]– dedikdə, Müaviyə: "Mən də (şahidlik edirəm)"– demişdir; (müəzzin): "Mən şahidlik edirəm ki, Muhəmməd Allahın elçisidir"[2]– dedikdə, Müaviyə: "Mən də (şahidlik edirəm)"– demişdir. Müəzzin azanı bitirdikdə (Müaviyə) demişdir: "Ey insanlar! Mən Peyğəmbərin ﷺ bu yerdə, müəzzin azan verərkən indi məndən eşitdiyinizi eynilə dediyini eşitmişəm." (əl-Buari, 914)

## 17-ci fəsil. Minbərdən xütbə vermək

## ١٧– باب: الْخُطْبَةُ عَلَى الْمِنْبَرِ

٥١٢ – عَنْ أَبِي حَازِمِ بْنِ دِينَارٍ رحمه الله أَنَّ رِجَالاً أَتَوْا سَهْلَ بْنَ سَعْدٍ السَّاعِدِيَّ رضي الله عنه، وَقَدِ امْتَرَوْا فِي الْمِنْبَرِ مِمَّ عُودُهُ فَسَأَلُوهُ عَنْ ذَلِكَ فَقَالَ: وَاللَّهِ إِنِّي لأَعْرِفُ مِمَّا هُوَ، وَلَقَدْ رَأَيْتُهُ أَوَّلَ يَوْمٍ وُضِعَ، وَأَوَّلَ يَوْمٍ جَلَسَ عَلَيْهِ رَسُولُ اللَّهِ ﷺ أَرْسَلَ رَسُولُ اللَّهِ ﷺ إِلَى فُلاَنَةَ – امْرَأَةٍ قَدْ سَمَّاهَا سَهْلٌ: «مُرِي غُلاَمَكِ النَّجَّارَ أَنْ يَعْمَلَ لِي أَعْوَادًا أَجْلِسُ عَلَيْهِنَّ إِذَا كَلَّمْتُ النَّاسَ». فَأَمَرَتْهُ فَعَمِلَهَا مِنْ طَرْفَاءِ الْغَابَةِ ثُمَّ جَاءَ بِهَا ، فَأَرْسَلَتْ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَأَمَرَ بِهَا فَوُضِعَتْ هَا هُنَا، ثُمَّ رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ صَلَّى عَلَيْهَا، وَكَبَّرَ وَهُوَ عَلَيْهَا، ثُمَّ رَكَعَ وَهُوَ عَلَيْهَا، ثُمَّ نَزَلَ الْقَهْقَرَى فَسَجَدَ فِي أَصْلِ الْمِنْبَرِ ثُمَّ عَادَ، فَلَمَّا فَرَغَ أَقْبَلَ عَلَى النَّاسِ فَقَالَ: «أَيُّهَا النَّاسُ إِنَّمَا صَنَعْتُ هَذَا لِتَأْتَمُّوا وَلِتَعَلَّمُوا صَلاَتِي». [رواه البخاري: ٩١٧]

**512.** Əbu Hazim ibn Dinar رحمه الله rəvayət edir ki, Peyğəmbərin ﷺ minbərinin hansı ağacdan düzəldildiyi barədə aralarına fikir ayrılığı düşmüş bir dəstə adam Səhl ibn Səd əs-Saidinin yanına gəlib bu haqda ondan soruşdu. O dedi: "Vallahi, mən onun nədən olduğunu yaxşı bilirəm. Mən onu həm qoyulduğu gün, həm də Peyğəmbərin ﷺ onun üstündə oturduğu ilk gündə görmüşəm. Peyğəmbər ﷺ filan[3] qadının yanına adam göndərib buyurdu ki: "Dülgər kölənə əmr et, mənim üçün ağacdan elə bir şey düzəltsin ki, mən camaata xütbə verərkən onun üstündə otura bilim." Qadın bunu öz köləsinə əmr etdi və o da meşə yulğunundan[4] minbər düzəldib onun yanına apardı. Qadın onu Peyğəmbərə ﷺ göndərdi, Peyğəmbər ﷺ də onun buraya qoyulmasını əmr etdi. Mən Peyğəmbərin ﷺ onun üstündə namaz qıldığını da görmüşəm. O, minbərin üstündə ikən: "Allahu Əkbər"– dedi, (Qurandan xeyli oxuduqdan) sonra rükuya getdi, (sonra rükudan qalxıb) dal-dalı gedərək (minbərdən) aşağı endi və minbərin dibində səcdə qıldı, sonra yenidən (minbərə qalxıb namazını) davam etdi. Namazı bitirdikdən sonra camaata tərəf dönüb dedi: "Ay camaat! Mən belə etdim ki, siz də mənə baxıb mənim etdiklərimi edəsiniz və mənim necə namaz qıldığımı öyrənəsiniz." (əl-Buxari, 917)

٥١٣ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: كَانَ جِذْعٌ يَقُومُ إِلَيْهِ النَّبِيُّ ﷺ فَلَمَّا وُضِعَ لَهُ الْمِنْبَرُ سَمِعْنَا لِلْجِذْعِ مِثْلَ أَصْوَاتِ الْعِشَارِ حَتَّى نَزَلَ النَّبِيُّ ﷺ فَوَضَعَ يَدَهُ عَلَيْهِ. [رواه البخاري: ٩١٨]

---

[1] Transkripsiyası: Əşhədu ənlə ilahə illəllah.
[2] Transkripsiyası: Əşhədu ənnə Muhəmmədən rəsulullah.
[3] Hədisi danışan ravi demişdir ki: "Səhl ibn Səd əs-Saidi رضي الله عنه onun adını çəkdi."
[4] 249-cu hədisin qeydlərinə bax.

**513.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ؓ demişdir: “Peyğəmbər ﷺ (xütbə verərkən) bir kötüyün yanında durardı. Onun üçün minbər qoyulduqda biz həmin kötüyün boğaz dəvənin (inildədiyi) kimi inildədiyini eşitdik. Peyğəmbər ﷺ (minbərdən) aşağı enib əlini onun üstünə qoyanadək (onun səsi kəsilmədi).” (əl-Buxari, 918)

## 18-ci fəsil. Xütbəni ayaq üstə vermək

## ١٨– باب: الْخُطْبَةُ قَائِمًا

**٥١٤ –** عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: كَانَ النَّبِيُّ ﷺ يَخْطُبُ قَائِمًا ثُمَّ يَقْعُدُ ثُمَّ يَقُومُ، كَمَا تَفْعَلُونَ الآنَ. [رواه البخاري: ٩٢٠]

**514.** Abdullah ibn Ömər ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ xütbəni ayaq üstə oxuyar, sonra (bir qədər) oturar, sonra yenə ayağa qalxardı; (o eynilə) siz indi etdiyiniz kimi (edərdi). (əl-Buxari, 920)

## 19-cu fəsil. Xütbə əsnasında (Allaha) təriflər deyəndən sonra “Sonra isə...” deyən kimsə haqqında

## ١٩– باب: مَنْ قَالَ فِى الْخُطْبَةِ بَعْدَ الثَّنَاءِ أَمَّا بَعْدُ

**٥١٥ –** عَنْ عَمْرِو بْنِ تَغْلِبَ ؓ أَنَّ رَسُولَ اللَّهِ ﷺ أُتِىَ بِمَالٍ أَوْ سَبْىٍ فَقَسَمَهُ، فَأَعْطَى رِجَالاً وَتَرَكَ رِجَالاً فَبَلَغَهُ أَنَّ الَّذِينَ تَرَكَ عَتَبُوا، فَحَمِدَ اللَّهَ ثُمَّ أَثْنَى عَلَيْهِ، ثُمَّ قَالَ: «أَمَّا بَعْدُ، فَوَاللَّهِ إِنِّى لأُعْطِى الرَّجُلَ، وَأَدَعُ الرَّجُلَ، وَالَّذِى أَدَعُ أَحَبُّ إِلَيَّ مِنَ الَّذِى أُعْطِى وَلَكِنْ أُعْطِى أَقْوَامًا لِمَا أَرَى فِى قُلُوبِهِمْ مِنَ الْجَزَعِ وَالْهَلَعِ، وَأَكِلُ أَقْوَامًا إِلَى مَا جَعَلَ اللَّهُ فِى قُلُوبِهِمْ مِنَ الْغِنَى وَالْخَيْرِ، فِيهِمْ عَمْرُو بْنُ تَغْلِبَ». فَوَاللَّهِ مَا أُحِبُّ أَنَّ لِى بِكَلِمَةِ رَسُولِ اللَّهِ ﷺ حُمْرَ النَّعَمِ. [رواه البخاري: ٩٢٣]

**515.** Amr ibn Təğlib ؓ rəvayət edir ki, (bir dəfə) Peyğəmbərə ﷺ pul və ya əsir gətirmişdilər. O, bunu bölüşdürüb (ondan) bəzilərinə pay verdi, bəzilərinə isə heç nə vermədi. Sonra ona xəbər çatdı ki, heç nə vermədiyi adamlar onu qınamışlar. Odur ki, o, Allaha həmd-səna edib Ona təriflər dedikdən sonra buyurdu: “Sonra isə... Vallahi, mən bir kimsəyə (pay) verib, başqa birisindən bunu əsirgəyə bilərəm. Lakin əsirgədiyim adamı (pay) verdiyim adamdan daha çox sevirəm. O adamlara da ona görə (pay) verirəm ki, onların qəlbində səbirsizlik və narahatçılıq görürəm, digərlərini isə Allahın onların qəlbində yaratdığı zənginliyə və xeyir-bərəkətə həvalə edirəm – Amr ibn Təğlib də onların arasındadır.”

(Amr ibn Təğlib ؓ demişdir): “Mən Peyğəmbərin ﷺ bu sözlərini qırmızı dəvələrə belə dəyişmərəm.” (əl-Buxari, 923)

**٥١٦ –** عَنْ أَبِى حُمَيْدٍ السَّاعِدِيِّ ؓ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَامَ عَشِيَّةً بَعْدَ الصَّلاَةِ، فَتَشَهَّدَ وَأَثْنَى عَلَى اللَّهِ بِمَا هُوَ أَهْلُهُ ثُمَّ قَالَ: «أَمَّا بَعْدُ». [رواه البخاري: ٩٢٥]

**516.** Əbu Humeyd əs-Saidi ﷺ rəvayət edir ki, (bir) axşam çağı Peyğəmbər ﷺ namazdan sonra ayağa qalxıb kəlmeyi-şəhadəti oxudu və Allaha – Ona layiq tərzdə təriflər dedikdən sonra buyurdu: "Sonra isə..." (əl-Buxari, 925)

٥١٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: صَعِدَ النَّبِيُّ ﷺ الْمِنْبَرَ وَكَانَ آخِرَ مَجْلِسٍ جَلَسَهُ مُتَعَطِّفًا مِلْحَفَةً عَلَى مَنْكِبَيْهِ، قَدْ عَصَبَ رَأْسَهُ بِعِصَابَةٍ دَسِمَةٍ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ثُمَّ قَالَ: «أَيُّهَا النَّاسُ إِلَيَّ». فَثَابُوا إِلَيْهِ ثُمَّ قَالَ: «أَمَّا بَعْدُ، فَإِنَّ هَذَا الْحَيَّ مِنَ الأَنْصَارِ يَقِلُّونَ، وَيَكْثُرُ النَّاسُ، فَمَنْ وَلِيَ شَيْئًا مِنْ أُمَّةِ مُحَمَّدٍ ﷺ فَاسْتَطَاعَ أَنْ يَضُرَّ فِيهِ أَحَدًا أَوْ يَنْفَعَ فِيهِ أَحَدًا، فَلْيَقْبَلْ مِنْ مُحْسِنِهِمْ، وَيَتَجَاوَزْ عَنْ مُسِيِّهِمْ». [رواه البخاري: ٩٢٧]

**517.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ minbərə qalxdı və bu onun minbərdəki son oturuşu idi. O, çiyninə atdığı əbaya bürünmüş, başına da boz bir sarıq sarımışdı, Allaha həmd edib şəninə təriflər deyəndən sonra: "Ey insanlar, yanıma gəlin!"– deyə buyurdu və onlar dərhal onun ətrafına toplandılar. Sonra dedi: "Sonra isə... bu ənsar camaatının sayı azalacaq, başqa insanların sayı isə çoxalacaq. Belə olduqda hər kim Muhəmməd ümmətinin üzərində hökmranlıq etsə, zərər vurmağa və ya fayda verməyə qadir olsa, qoy ənsardan yaxşı iş görənlərin (yaxşılığını) qəbul etsin, pislik edənləri də bağışlasın." (əl-Buxari, 927)

## 20-ci fəsil. İmam xütbə verdiyi zaman kiminsə gəlib (oturduğunu) görərsə, ona iki rükət namaz qılmağı buyurmalıdır

## ٢٠ – باب: إِذَا رَأَى الإِمَامُ رَجُلاً جَاءَ وَهُوَ يَخْطُبُ أَمَرَهُ أَنْ يُصَلِّيَ رَكْعَتَيْنِ

٥١٨ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: جَاءَ رَجُلٌ وَالنَّبِيُّ ﷺ يَخْطُبُ النَّاسَ يَوْمَ الْجُمُعَةِ فَقَالَ: «أَصَلَّيْتَ يَا فُلاَنُ». قَالَ لاَ. قَالَ: «قُمْ فَارْكَعْ». [رواه البخاري: ٩٣٠]

**518.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "Cümə günü Peyğəmbər ﷺ xütbə verərkən bir adam (məscidə) daxil oldu və (Peyğəmbər ﷺ ondan): "Ey filankəs, namaz qıldınmı?"– deyə soruşdu. O adam: "Xeyr"– deyə cavab verdi. (Onda Peyğəmbər ﷺ) buyurdu: "Elə isə qalx, namaz qıl!" (əl-Buxari, 930)

## 21-ci fəsil. Cümə günü xütbə zamanı yağışın yağması üçün Allaha dua etmək

## ٢١ – باب: الاِسْتِسْقَاءُ فِي الْخُطْبَةِ يَوْمَ الْجُمُعَةِ

٥١٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ أَصَابَتِ النَّاسَ سَنَةٌ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ فَبَيْنَا النَّبِيُّ ﷺ يَخْطُبُ فِي يَوْمِ جُمُعَةٍ قَامَ أَعْرَابِيٌّ فَقَالَ يَا رَسُولَ اللَّهِ هَلَكَ الْمَالُ وَجَاعَ الْعِيَالُ، فَادْعُ اللَّهَ لَنَا. فَرَفَعَ يَدَيْهِ، وَمَا نَرَى فِي السَّمَاءِ قَزَعَةً، فَوَالَّذِي نَفْسِي بِيَدِهِ مَا وَضَعَهَا حَتَّى ثَارَ السَّحَابُ أَمْثَالَ الْجِبَالِ، ثُمَّ لَمْ يَنْزِلْ عَنْ مِنْبَرِهِ حَتَّى رَأَيْتُ الْمَطَرَ يَتَحَادَرُ عَلَى لِحْيَتِهِ ﷺ فَمُطِرْنَا يَوْمَنَا ذَلِكَ، وَمِنَ الْغَدِ، وَبَعْدَ الْغَدِ وَالَّذِي يَلِيهِ، حَتَّى الْجُمُعَةِ الأُخْرَى، وَقَامَ ذَلِكَ

الأَعْرَابِىُّ – أَوْ قَالَ غَيْرُهُ – فَقَالَ يَا رَسُولَ اللَّهِ، تَهَدَّمَ الْبِنَاءُ وَغَرِقَ الْمَالُ، فَادْعُ اللَّهَ لَنَا. فَرَفَعَ يَدَيْهِ، فَقَالَ: «اللَّهُمَّ حَوَالَيْنَا، وَلاَ عَلَيْنَا». فَمَا يُشِيرُ بِيَدِهِ إِلَى نَاحِيَةٍ مِنَ السَّحَابِ إِلاَّ انْفَرَجَتْ، وَصَارَتِ الْمَدِينَةُ مِثْلَ الْجَوْبَةِ، وَسَالَ الْوَادِى قَنَاةُ شَهْرًا، وَلَمْ يَجِئْ أَحَدٌ مِنْ نَاحِيَةٍ إِلاَّ حَدَّثَ بِالْجَوْدِ. [رواه البخاري: ٩٣٣]

**519.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: “Peyğəmbərin ﷺ yaşadığı dövrdə insanlara quraqlıq üz vermişdi. Peyğəmbər ﷺ cümə günü xütbə verərkən bir bədəvi ayağa qalxıb dedi: “Ey Allahın elçisi, mallar zay oldu, uşaqlar ac qaldı. Bizim üçün Allaha dua et!” Peyğəmbər ﷺ əllərini göyə qaldırdı. O an biz göydə bir dənə də olsun bulud görmürdük. Canım Əlində olan Allaha and olsun ki, o, hələ əllərini aşağı salmamış (başımız üzərində) dağlar qədər buludlar topalaşdı və o, minbərdən yerə enməmiş mən onun saqqalından süzülən yağış damçılarını gördüm. Həmin gün, ertəsi gün, ondan sonrakı gün, daha sonrakı gün – növbəti cüməyədək yağış ara vermədən yağdı. (Cümə günü) həmin bədəvi (və ya başqa birisi) ayağa qalxıb dedi: “Ey Allahın elçisi, evlər dağıldı, mallar su altında qaldı. Bizim üçün Allaha dua et!” Peyğəmbər ﷺ əllərini göyə qaldırıb dedi: “Allahım! (Yağışı) üstümüzə deyil, ətrafımıza yağdır.[1]” Sonra əli ilə hara işarə etdisə, oradakı bulud topası dağıldı və Mədinə (səması) çalaya bənzədi.[2] Qənat vadisində bir ay sel axdı, kənardan (Mədinəyə) gələn hər kəs bol yağışlar yağdığından danışırdı. (əl-Buxari, 933)

## 22-ci fəsil. Cümə günü imam xütbə verərkən susmaq

## ٢٢– باب: الإِنْصَاتُ يَوْمَ الْجُمُعَةِ وَالإِمَامُ يَخْطُبُ

٥٢٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا قُلْتَ لِصَاحِبِكَ يَوْمَ الْجُمُعَةِ أَنْصِتْ. وَالإِمَامُ يَخْطُبُ فَقَدْ لَغَوْتَ». [رواه البخاري: ٩٣٤]

**520.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cümə günü imam xütbə verərkən sən yanındakı adama: “Sus”– desən, mənasız söz danışmış olarsan”[3]. (əl-Buxari, 934)

## 23-cü fəsil. Cümə gününün (xeyirli) saatı

## ٢٣– باب: السَّاعَةُ الَّتِى فِى يَوْمِ الْجُمُعَةِ

٥٢١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ ذَكَرَ يَوْمَ الْجُمُعَةِ فَقَالَ: «فِيهِ سَاعَةٌ لاَ يُوَافِقُهَا عَبْدٌ مُسْلِمٌ، وَهْوَ قَائِمٌ يُصَلِّى، يَسْأَلُ اللَّهَ تَعَالَى شَيْئًا إِلاَّ أَعْطَاهُ إِيَّاهُ». وَأَشَارَ بِيَدِهِ يُقَلِّلُهَا. [رواه البخاري: ٩٣٥]

**521.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ cümə gününü yada salıb dedi: “Bu gündə elə bir saat var ki, müsəlman olan hər kim (həmin vaxt) namaz qılıb Uca Allahdan bir şey istəsə, Allah ona istədiyini mütləq verər.” Sonra o, əli ilə işarə edib həmin vaxtın olduqca az olduğunu göstərdi. (əl-Buxari, 935)

---

[1] Transkripsiyası: Allahummə həvaleynə və lə aleynə.
[2] Yəni göyün üzü açıldı və Mədinənin ətrafı buludlarla əhatə olundu.
[3] Burada xütbə əsnasında danışan hər kəsin savabdan məhrum olacağı qəsd edilir.

## 24-cü fəsil. Cümə namazı qılınarkən bəzi adamların imamı tərk etməsi haqqında

## ٢٤– باب:
## إِذَا نَفَرَ النَّاسُ عَنِ الإِمَامِ فِى صَلاَةِ الْجُمُعَةِ

٥٢٢ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ بَيْنَمَا نَحْنُ نُصَلِّى مَعَ النَّبِىِّ ﷺ إِذْ أَقْبَلَتْ عِيرٌ تَحْمِلُ طَعَامًا، فَالْتَفَتُوا إِلَيْهَا حَتَّى مَا بَقِىَ مَعَ النَّبِىِّ ﷺ إِلاَّ اثْنَا عَشَرَ رَجُلاً، فَنَزَلَتْ هَذِهِ الآيَةُ: ﴿ وَإِذَا رَأَوْا تِجَارَةً أَوْ لَهْوًا انفَضُّوا إِلَيْهَا وَتَرَكُوكَ قَائِمًا ﴾ [رواه البخاري: ٩٣٦]

**522.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) biz Peyğəmbərlə ﷺ birlikdə namaz qılarkən ərzaq yüklü dəvə karvanı gəldi. Hamı tələsik karvana tərəf getdi. Peyğəmbərin ﷺ yanında isə cəmi on iki nəfər qaldı və həmin vaxt bu ayə nazil oldu: "Onlar ticarət və ya əyləncə gördükləri zaman dağılışıb ona tərəf qaçdılar və səni (minbərdə) ayaq üstə olduğun halda tərk etdilər"[1]. (əl-Buxari, 936)

## 25-ci fəsil. Cümə namazından əvvəl və ondan sonra qılınan (könüllü) namazlar

## ٢٥– باب:
## الصَّلاَةُ بَعْدَ الْجُمُعَةِ وَقَبْلَهَا

٥٢٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يُصَلِّى قَبْلَ الظُّهْرِ رَكْعَتَيْنِ، وَبَعْدَهَا رَكْعَتَيْنِ، وَبَعْدَ الْمَغْرِبِ رَكْعَتَيْنِ فِى بَيْتِهِ، وَبَعْدَ الْعِشَاءِ رَكْعَتَيْنِ وَكَانَ لاَ يُصَلِّى بَعْدَ الْجُمُعَةِ حَتَّى يَنْصَرِفَ فَيُصَلِّى رَكْعَتَيْنِ. [رواه البخاري: ٩٣٧]

**523.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ zöhrdən həm əvvəl, həm də sonra iki rükət namaz qılardı, habelə məğrib və işa namazlarından sonra öz evində iki rükət namaz qılardı, cümə namazından sonra isə məsciddən çıxıb gedənədək namaz qılmaz, (ancaq evində) iki rükət namaz qılardı. (əl-Buxari, 937)

[1] "əl-Cumuə" surəsi, 11

# ١٢ – كِتَابُ الخَوْفِ

# 12 – Qorxu (namazı) kitabı

## ١ – باب: صَلاَةُ الْخَوْفِ

## 1-ci fəsil. Qorxu namazı

٥٢٤ – عَنْ عَبْدِ اللَّهِ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: غَزَوْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ قِبَلَ نَجْدٍ، فَوَازَيْنَا الْعَدُوَّ، فَصَافَفْنَا لَهُمْ فَقَامَ رَسُولُ اللَّهِ ﷺ يُصَلِّي لَنَا فَقَامَتْ طَائِفَةٌ مَعَهُ تُصَلِّي، وَأَقْبَلَتْ طَائِفَةٌ عَلَى الْعَدُوِّ وَرَكَعَ رَسُولُ اللَّهِ ﷺ بِمَنْ مَعَهُ، وَسَجَدَ سَجْدَتَيْنِ، ثُمَّ انْصَرَفُوا مَكَانَ الطَّائِفَةِ الَّتِي لَمْ تُصَلِّ، فَجَاءُوا، فَرَكَعَ رَسُولُ اللَّهِ ﷺ بِهِمْ رَكْعَةً، وَسَجَدَ سَجْدَتَيْنِ ثُمَّ سَلَّمَ، فَقَامَ كُلُّ وَاحِدٍ مِنْهُمْ فَرَكَعَ لِنَفْسِهِ رَكْعَةً وَسَجَدَ سَجْدَتَيْنِ. [رواه البخاري: ٩٤٢]

**524.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Mən Peyğəmbərlə ﷺ birlikdə Nəcd istiqamətində gedən döyüşdə iştirak etdim. Biz düşmənlə qarşı-qarşıya gəldikdə onlarla üzbəüz durub cərgələrə düzüldük. Bundan sonra Peyğəmbər ﷺ bizə namaz qıldırmağa durdu. Bu vaxt (əshabələrin) bir qismi onunla birlikdə namaza durdu, digərləri isə düşmənə tərəf yönəldi. Peyğəmbər ﷺ (namaza) duranlarla birlikdə rükuya getdi və iki səcdə etdi[1]. Sonra onlar (arxaya çəkilib) namaz qılmayanların yerini tutdular, namaz qılmayanlar isə (namaza) durdular. Peyğəmbər ﷺ (namaza) duranlarla birlikdə rükuya getdi və iki səcdə qıldı. O, salam verdikdən sonra hər kəs qalxıb ayrı-ayrılıqda bir rükət namaz qıldı." (əl-Buxari, 942)

## ٢ – باب: صَلاَةُ الْخَوْفِ رِجَالاً وَرُكْبَانًا

## 2-ci fəsil. Qorxu namazını istər ayaq üstə, istərsə də minik üzərində qılmaq olar

٥٢٥ – عَنْهُ رضي الله عنهما – فِي رِوَايَةٍ – قَالَ: عَنِ النَّبِيِّ ﷺ :«وَإِنْ كَانُوا أَكْثَرَ مِنْ ذَلِكَ فَلْيُصَلُّوا قِيَامًا وَرُكْبَانًا». [رواه البخاري: ٩٤٣]

**525.** Abdullah ibn Ömərin رضي الله عنهما rəvayət etdiyi başqa bir hədisdə Peyğəmbər ﷺ demişdir: "Əgər (düşmənin sayı) bundan[2] çox olarsa, qoy müsəlmanlar namazlarını ayaq üstə və ya minik üstündə qılsınlar." (əl-Buxari, 943)

## ٣ – باب: صَلاَةُ الطَّالِبِ وَالْمَطْلُوبِ رَاكِبًا وَإِيمَاءً

## 3-cü fəsil. Həm təqib edən, həm də təqib olunan kimsə minik üzərində, başla işarə edərək namaz qıla bilər

٥٢٦ – عَنْهُ رضي الله عنهما قَالَ: قَالَ النَّبِيُّ ﷺ لَنَا لَمَّا رَجَعَ مِنَ الأَحْزَابِ: «لاَ يُصَلِّيَنَّ أَحَدٌ الْعَصْرَ إِلاَّ فِي بَنِي قُرَيْظَةَ». فَأَدْرَكَ بَعْضُهُمُ الْعَصْرَ فِي الطَّرِيقِ فَقَالَ بَعْضُهُمْ لاَ نُصَلِّي حَتَّى نَأْتِيَهَا، وَقَالَ بَعْضُهُمْ بَلْ نُصَلِّي لَمْ يُرِدْ مِنَّا ذَلِكَ. فَذُكِرَ لِلنَّبِيِّ ﷺ فَلَمْ يُعَنِّفْ أَحَدًا مِنْهُمْ. [رواه البخاري: ٩٤٦]

---

[1] Yəni arxasındakılara bir rükət namaz qıldırdı.

[2] Burada "bundan" deyildikdə, müsəlmanlar nəzərdə tutulur.

**526.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Əhzab döyüşündən sonra (Mədinəyə) qayıtdıqda bizə dedi: "Qoy hər kəs əsr namazını ancaq Bəni Qureyzə qəbiləsində qılsın." Bəziləri əsr namazına yolda yetişdi. Onlardan bəziləri dedilər: "Biz oraya çatanadək namaz qılmayacağıq." Digərləri isə dedilər: "Yox, namazı (burada) qılaq, çünki Peyğəmbər ﷺ bizdən bunu tələb etmirdi." Sonra bu haqda Peyğəmbərə ﷺ xəbər verdilər və o, (buna görə) onların heç birini qınamadı. (əl-Buxari, 946)

# ١٣ – كِتَابُ العِيْدَيْنِ

# 13 – İki bayram[1] kitabı

## ١ – باب: الْحِرَابُ وَالدَّرَقِ يَوْمَ الْعِيدِ

## 1-ci fəsil. Bayram günü nizə və qalxan[2] (oynadıb şənlənmək)

٥٢٧ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: دَخَلَ عَلَيَّ رَسُولُ اللَّهِ ﷺ وَعِنْدِي جَارِيَتَانِ تُغَنِّيَانِ بِغِنَاءِ بُعَاثَ، فَاضْطَجَعَ عَلَى الْفِرَاشِ وَحَوَّلَ وَجْهَهُ، وَدَخَلَ أَبُو بَكْرٍ فَانْتَهَرَنِي وَقَالَ مِزْمَارَةُ الشَّيْطَانِ عِنْدَ النَّبِيِّ ﷺ فَأَقْبَلَ عَلَيْهِ رَسُولُ اللَّهِ ﷺ فَقَالَ: «دَعْهُمَا» فَلَمَّا غَفَلَ غَمَزْتُهُمَا فَخَرَجَتَا. [رواه البخاري: ٩٤٩]

**527.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "(Bir dəfə) yanımda olan iki qız uşağı Buas döyüşünə[3] dair nəğmə oxuyarkən Peyğəmbər ﷺ gəlib otağıma daxil oldu və yatağa uzanıb üzünü çevirdi." Bu vaxt Əbu Bəkr رضي الله عنه içəri daxil oldu və məni qınayıb dedi: "Peyğəmbərin ﷺ yanında şeytan nəğmələri (oxuyursunuz)?" Peyğəmbər ﷺ ona tərəf dönüb dedi: "Uşaqlarda işin olmasın!" Əbu Bəkrin diqqəti yayındıqda mən xəlvətcə qızlara işarə etdim və onlar çıxıb getdilər." (əl-Buxari, 949)

## ٢ – باب: الأَكْلُ يَوْمَ الْفِطْرِ قَبْلَ الْخُرُوجِ

## 2-ci fəsil. Orucluq bayramında (namazdan əvvəl xurma və s.) yemək

٥٢٨ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ كَانَ رَسُولُ اللَّهِ ﷺ لاَ يَغْدُو يَوْمَ الْفِطْرِ حَتَّى يَأْكُلَ تَمَرَاتٍ. وَفِي رِوَايَةٍ عَنْهُ قَالَ: وَيَأْكُلُهُنَّ وِتْرًا. [رواه البخاري: ٩٥٣]

**528.** Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ orucluq bayramında bir neçə xurma yemədən (bayram namazına) getməzdi.

Başqa hədisdə Ənəs رضي الله عنه demişdir: "...onları tək sayda yeyərdi." (əl-Buxari, 953)

## ٣ – باب: الأَكْلُ يَوْمَ النَّحْرِ

## 3-cü fəsil. Qurban bayramında (qurban ətindən və s.) yemək

٥٢٩ – عَنْ الْبَرَاءِ رضي الله عنه قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَخْطُبُ فَقَالَ: «إِنَّ أَوَّلَ مَا نَبْدَأُ مِنْ يَوْمِنَا هَذَا أَنْ نُصَلِّيَ، ثُمَّ نَرْجِعَ فَنَنْحَرَ، فَمَنْ فَعَلَ فَقَدْ أَصَابَ سُنَّتَنَا». [رواه البخاري: ٩٥١]

**529.** Rəvayət edilir ki, Bəra رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ xütbə verərkən belə dediyini eşitdim: "Biz bu günümüzdə ilk əvvəl namaz qılmalı, sonra da qayıdıb qurban kəsməliyik. Kim belə etsə, Sünnəmizə uyğun iş görmüş olar." (əl-Buxari, 951)

---

[1] Bayram deyildikdə orucluq və qurban bayramları nəzərdə tutulur.

[2] Qeyd etmək lazımdır ki, bayram günü nizə və qalxan oynatmaq və ya bayram namazına gəldikdə nizə və qalxan gətirmək sünnə deyildir. Əksinə, həbəşilərin bayram günü nizə və qalxan oynatması adətdir və heç bir adət-ənənə din sayıla bilməz.

[3] Buas – Mədinənin yaxınlığında olan yer adıdır. Həmin yerdə Ovs və Xəzrəc qəbilələri arasında döyüş olmuş və bu döyüşdə ovslular qələbə qazanmışlar.

٥٣٠ – عَنْهُ ﷺ قَالَ: خَطَبَنَا النَّبِيُّ ﷺ يَوْمَ الأَضْحَى بَعْدَ الصَّلاَةِ فَقَالَ: «مَنْ صَلَّى صَلاَتَنَا وَنَسَكَ نُسُكَنَا فَقَدْ أَصَابَ النُّسُكَ، وَمَنْ نَسَكَ قَبْلَ الصَّلاَةِ فَإِنَّهُ قَبْلَ الصَّلاَةِ، وَلاَ نُسُكَ لَهُ». فَقَالَ أَبُو بُرْدَةَ بْنُ نِيَارٍ ﷺ خَالُ الْبَرَاءِ ﷺ يَا رَسُولَ اللَّهِ، فَإِنِّي نَسَكْتُ شَاتِي قَبْلَ الصَّلاَةِ، وَعَرَفْتُ أَنَّ الْيَوْمَ يَوْمُ أَكْلٍ وَشُرْبٍ، وَأَحْبَبْتُ أَنْ تَكُونَ شَاتِي أَوَّلَ مَا يُذْبَحُ فِي بَيْتِي، فَذَبَحْتُ شَاتِي وَتَغَدَّيْتُ قَبْلَ أَنْ آتِيَ الصَّلاَةَ. قَالَ: «شَاتُكَ شَاةُ لَحْمٍ». قَالَ يَا رَسُولَ اللَّهِ، فَإِنَّ عِنْدَنَا عَنَاقًا لَنَا جَذَعَةً هِيَ أَحَبُّ إِلَيَّ مِنْ شَاتَيْنِ، أَفَتَجْزِي عَنِّي قَالَ: «نَعَمْ، وَلَنْ تَجْزِيَ عَنْ أَحَدٍ بَعْدَكَ». [رواه البخاري: ٩٥٥]

**530.** Rəvayət edilir ki, Bəra ﷺ demişdir: “Qurban günü Peyğəmbər ﷺ namazdan sonra bizə xütbə verdi və buyurdu: “Kim bizim kimi namaz qılarsa və bizim kimi qurban kəsərsə, qurbanlıq heyvanını (şəriətə uyğun) kəsmiş olar. Kim (qurbanlıq heyvanı bayram) namazından əvvəl kəsərsə, namazdan qabaq (özü üçün heyvan kəsmiş) olar və onun qurbanı qəbul olunmaz.” (Bu vaxt) Bəranın ﷺ dayısı Əbu Burdə ibn Niyar ﷺ dedi: “Ey Allahın elçisi, mən öz qoyunumu namazdan əvvəl kəsdim; mən bilirdim ki, bu gün yemək-içmək günüdür, elə buna görə də istədim ki, mənim qoyunum evimdə kəsilən ilk qurbanlıq olsun. Odur ki, namaza gəlməmişdən əvvəl qoyunumu kəsib (bir az ondan) yedim.” Peyğəmbər ﷺ buyurdu: “Sənin qoyunun ətlik qoyundur.” Əbu Burdə ﷺ dedi: “Ey Allahın elçisi, bizim bir çəpişimiz var ki, o, mənim üçün iki qoyundan sevimlidir, mən onunla (qurbanlığı) əvəz edə bilərəmmi?” Peyğəmbər ﷺ buyurdu: “Bəli, ancaq o, səndən sonra heç kəsə əvəz sayıla bilməz.” (əl-Buxari, 955)

## ٤ – باب: الْخُرُوجُ إِلَى الْمُصَلَّى بِغَيْرِ مِنْبَرٍ

## 4-cü fəsil. Minbər olmayan namazgahda (bayram) namazlarını qılmaq

٥٣١ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَخْرُجُ يَوْمَ الْفِطْرِ وَالأَضْحَى إِلَى الْمُصَلَّى، فَأَوَّلُ شَيْءٍ يَبْدَأُ بِهِ الصَّلاَةُ ثُمَّ يَنْصَرِفُ، فَيَقُومُ مُقَابِلَ النَّاسِ، وَالنَّاسُ جُلُوسٌ عَلَى صُفُوفِهِمْ، فَيَعِظُهُمْ وَيُوصِيهِمْ وَيَأْمُرُهُمْ، فَإِنْ كَانَ يُرِيدُ أَنْ يَقْطَعَ بَعْثًا قَطَعَهُ، أَوْ يَأْمُرَ بِشَيْءٍ أَمَرَ بِهِ، ثُمَّ يَنْصَرِفُ. قَالَ أَبُو سَعِيدٍ ﷺ فَلَمْ يَزَلِ النَّاسُ عَلَى ذَلِكَ حَتَّى خَرَجْتُ مَعَ مَرْوَانَ وَهْوَ أَمِيرُ الْمَدِينَةِ فِي أَضْحًى أَوْ فِطْرٍ، فَلَمَّا أَتَيْنَا الْمُصَلَّى إِذَا مِنْبَرٌ بَنَاهُ كَثِيرُ بْنُ الصَّلْتِ، فَإِذَا مَرْوَانُ يُرِيدُ أَنْ يَرْتَقِيَهُ قَبْلَ أَنْ يُصَلِّيَ، فَجَبَذْتُ بِثَوْبِهِ فَجَبَذَنِي فَارْتَفَعَ، فَخَطَبَ قَبْلَ الصَّلاَةِ، فَقُلْتُ لَهُ غَيَّرْتُمْ وَاللَّهِ. فَقَالَ يَا أَبَا سَعِيدٍ، قَدْ ذَهَبَ مَا تَعْلَمُ. فَقُلْتُ مَا أَعْلَمُ وَاللَّهِ خَيْرٌ مِمَّا لاَ أَعْلَمُ. فَقَالَ إِنَّ النَّاسَ لَمْ يَكُونُوا يَجْلِسُونَ لَنَا بَعْدَ الصَّلاَةِ فَجَعَلْتُهَا قَبْلَ الصَّلاَةِ. [رواه البخاري: ٩٥٦]

**531.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: “Peyğəmbər ﷺ orucluq və qurban bayramlarında namaz qılınan yerə gəlib əvvəlcə namaz qılardı. Namazı bitirdikdən sonra ayağa qalxıb cərgəbəcərgə oturmuş insanların qarşısında durar, onlara öyüd-nəsihətlər, tövsiyələr və əmrlər verərdi. Əgər harasa bir qoşun göndərmək istəsəydi, onu göndərər və ya bir şey əmr etmək istəsəydi, onu əmr edərdi, sonra da çıxıb gedərdi.”

Əbu Səid ﷺ (rəvayətinə davam edib) demişdir: “Mən Mədinənin əmiri Mərvanla[1] birlikdə orucluq ya da qurban bayramında namaz qılınan yerə getdiyim günədək camaat bu (sünnəyə) riayət edirdi. Biz namaz qılınan yerə gəlib

[1] Mərvan miladi təqvimi ilə 661-ci ildə Mədinənin əmiri təyin edilmişdir.

çatdıqda mən Kəsir ibn Səltin düzəltdiyi minbəri gördüm və bir də baxdım ki, Mərvan namazı qılmamış minbərə qalxmaq istəyir. Mən onun ətəyindən dartdım, lakin o ətəyini dartıb (əlimdən aldı) və (minbərə) qalxıb namazdan əvvəl xütbə verdi. Mən ona dedim: "Vallahi, siz (Sünnəni) dəyişdirdiniz!" O dedi: "Ey Əbu Səid, sənin bildiyin keçmişdə qalmışdır." Mən dedim: "Vallahi, mənim bildiyim, bilmədiyimdən daha xeyirlidir." O dedi: "Camaat namazdan sonra oturub (xütbəni) dinləmir deyə, mən onu namazdan əvvəl verdim." (əl-Buxari, 956)

## 5-ci fəsil. Azan və iqamə verilmədən qılınan bayram namazlarına piyada və ya minik üzərində getmək

## ٥– باب: الْمَشْىُ وَالرُّكُوبُ إِلَى الْعِيدِ بِغَيْرِ أَذَانٍ وَلاَ إِقَامَةٍ

٥٣٢ – عَنْ ابْنِ عَبَّاسٍ وَعَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهم قَالاَ: لَمْ يَكُنْ يُؤَذَّنُ يَوْمَ الْفِطْرِ وَلاَ يَوْمَ الأَضْحَى. [رواه البخاري: ٩٦٠]

**532.** İbn Abbas və Cabir ibn Abdullah ﷺ rəvayət edirlər ki, orucluq və qurban bayramlarında azan verilməzdi. (əl-Buxari, 960)

## 6-cı fəsil. Xütbə bayram namazından sonra verilməlidir

## ٦– باب: الْخُطْبَةُ بَعْدَ الْعِيدِ

٥٣٣ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: شَهِدْتُ الْعِيدَ مَعَ رَسُولِ اللَّهِ ﷺ وَأَبِى بَكْرٍ وَعُمَرَ وَعُثْمَانَ رضي الله عنهم فَكُلُّهُمْ كَانُوا يُصَلُّونَ قَبْلَ الْخُطْبَةِ. [رواه البخاري: ٩٦٢]

**533.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Mən Peyğəmbər ﷺ, Əbu Bəkr, Ömər və Osmanla birlikdə bayram namazlarında iştirak etmişəm. Onların hamısı namazı xütbədən qabaq qılardı." (əl-Buxari, 962)

## 7-ci fəsil. Təşriq[1] günlərində (yerinə yetirilən) əməllərin fəziləti

## ٧– باب: فَضْلُ الْعَمَلِ فِى أَيَّامِ التَّشْرِيقِ

٥٣٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما، عَنِ النَّبِىِّ ﷺ أَنَّهُ قَالَ: «مَا الْعَمَلُ فِى أَيَّامٍ أَفْضَلُ مِنْهَا فِى هَذِهِ الْعَشْرِ». قَالُوا وَلاَ الْجِهَادُ قَالَ: «وَلاَ الْجِهَادُ، إِلاَّ رَجُلٌ خَرَجَ يُخَاطِرُ بِنَفْسِهِ وَمَالِهِ فَلَمْ يَرْجِعْ بِشَىْءٍ». [رواه البخاري: ٩٦٩]

**534.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Zülhiccə ayının ilk) on günündə (yerinə yetirilən) əməllər, bu (təşriq) günlərində (yerinə yetirilən) əməllərdən üstün deyildir." (Əshabələr) soruşdular: "Cihad da (üstün deyilmi)?" O dedi: "Cihad da (üstün deyildir). Yalnız canını və malını təhlükəyə ataraq cihad edib hər ikisini (Allah yolunda) fəda edən kimsədən başqa." (əl-Buxari, 969)

[1] Zülhiccə ayının 11-ci, 12-ci və 13-cü günlərinə təşriq günləri deyilir.

## 8-ci fəsil. Minada keçən günlərdə, habelə Ərəfata doğru irəlilədikdə (təkrar-təkrar) “Allahu Əkbər” demək

## ٨– باب: التَّكْبِيرُ أَيَّامَ مِنًى وَإِذَا غَدَا إِلَى عَرَفَةَ

**٥٣٥** – عَنْ أَنَسٍ ﷺ أَنَّهُ سُئِلَ عَنِ التَّلْبِيَةِ: كَيْفَ كُنْتُمْ تَصْنَعُونَ مَعَ النَّبِيِّ ﷺ؟ قَالَ كَانَ يُلَبِّى الْمُلَبِّى لاَ يُنْكَرُ عَلَيْهِ، وَيُكَبِّرُ الْمُكَبِّرُ فَلاَ يُنْكَرُ عَلَيْهِ. [رواه البخاري: ٩٧٠]

**535.** Rəvayət edilir ki, Ənəsdən ﷺ təlbiyə[1] haqqında soruşdular ki: “Siz Peyğəmbərlə ﷺ bir yerdə ikən (bunu) necə edirdiniz?” O dedi: “Nə təlbiyə deyən adam, nə də təkbir oxuyan adam qınanmazdı.” (əl-Buxari, 970)

## 9-cu fəsil. Qurban günlərində (dəvələri və digər heyvanları) namazgahda kəsmək

## ٩– باب: النَّحْرُ وَالذَّبْحُ يَوْمَ النَّحْرِ بِالْمُصَلَّى

**٥٣٦** – عَنِ ابْنِ عُمَرَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَنْحَرُ أَوْ يَذْبَحُ بِالْمُصَلَّى. [رواه البخاري: ٩٨٢]

**536.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (qurban günləri) dəvələri və digər heyvanları namazgahda kəsərdi. (əl-Buxari, 982)

## 10-cu fəsil. Bayram namazını qılıb (evə) dönərkən başqa yolla qayıtmaq

## ١٠– باب: مَنْ خَالَفَ الطَّرِيقَ إِذَا رَجَعَ يَوْمَ الْعِيدِ

**٥٣٧** – عَنْ جَابِرٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا كَانَ يَوْمُ عِيدٍ خَالَفَ الطَّرِيقَ. [رواه البخاري: ٩٨٦]

**537.** Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bayram günü (namazdan sonra evə) qayıtdıqda gəldiyi yolla qayıtmazdı. (əl-Buxari, 986)

**٥٣٨** – (أ)– عَنْ عَائِشَةَ ﷺ، أَنَّ أَبَا بَكْرٍ ﷺ دَخَلَ عَلَيْهَا وَعِنْدَهَا جَارِيَتَانِ فِى أَيَّامِ مِنًى تُدَفِّفَانِ وَتَضْرِبَانِ، وَالنَّبِيُّ ﷺ مُتَغَشٍّ بِثَوْبِهِ، فَانْتَهَرَهُمَا أَبُو بَكْرٍ ﷺ فَكَشَفَ النَّبِيُّ ﷺ عَنْ وَجْهِهِ فَقَالَ: «دَعْهُمَا يَا أَبَا بَكْرٍ فَإِنَّهَا أَيَّامُ عِيدٍ، وَتِلْكَ الأَيَّامُ أَيَّامُ مِنًى». [رواه البخاري: ٩٨٧]

**538.** (a) – Aişədən ﷺ rəvayət edilir ki, o, Minada olarkən onun yanında iki qız uşağı dəf çalırdı, Peyğəmbər ﷺ də əbasına bürünüb (uzanmışdı). Bu vaxt Əbu Bəkr onun yanına daxil oldu və (uşaqların çalıb-oynadığını görüb) onlara acıqlandı. Peyğəmbər ﷺ üzünü açıb buyurdu: “Dəymə onlara, ey Əbu Bəkr, çünki bu günlər bayram günləridir. Bu günlər Minada (qalma) günləridir.” (əl-Buxari, 987)

**٥٣٨** – (ب)– عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: رَأَيْتُ النَّبِيَّ ﷺ يَسْتُرُنِى، وَأَنَا أَنْظُرُ إِلَى الْحَبَشَةِ وَهُمْ يَلْعَبُونَ فِى الْمَسْجِدِ، فَزَجَرَهُمْ عُمَرُ فَقَالَ النَّبِيُّ ﷺ: «دَعْهُمْ، أَمْنًا بَنِى أَرْفِدَةَ». [رواه البخاري: ٩٨٨]

**538.** (b) – Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “(Bir dəfə) mən məsciddə oynayan həbəşilərə baxarkən Peyğəmbər ﷺ otağımın qapısı önünə örtük tutdu. Ömər onları dayandırmaq istədikdə, Peyğəmbər ﷺ buyurdu: “Onlarla işin olmasın... Sərbəst olun, ey Ərfidə oğulları!” (əl-Buxari, 988)

[1] 132-ci hədisin qeydlərinə bax.

# ١٤ – كِتَابُ الوِتْرِ

# 14 – Vitr kitabı

## ١– باب: مَا جَاءَ فِي الْوِتْرِ

## 1-ci fəsil. Vitr (namazı) haqqında varid olanlar

٥٣٩ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما، أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللَّهِ ﷺ عَنْ صَلاَةِ اللَّيْلِ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «صَلاَةُ اللَّيْلِ مَثْنَى مَثْنَى، فَإِذَا خَشِيَ أَحَدُكُمُ الصُّبْحَ صَلَّى رَكْعَةً وَاحِدَةً، تُوتِرُ لَهُ مَا قَدْ صَلَّى». [رواه البخاري: ٩٩٠]

**539.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ gecə namazı barəsində soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Gecə namazı iki rükət-iki rükət qılınır və əgər sizdən biriniz səhərin açılacağından ehtiyat etsə, qoy bir rükət də qılsın. Bu onun qıldığı namazların (sayını) təkləşdirər." (əl-Buxari, 990)

٥٤٠ – عَنْ عَائِشَةَ رضي الله عنها، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يُصَلِّي إِحْدَى عَشْرَةَ رَكْعَةً، كَانَتْ تِلْكَ صَلاَتَهُ – تَعْنِي بِاللَّيْلِ – فَيَسْجُدُ السَّجْدَةَ مِنْ ذَلِكَ قَدْرَ مَا يَقْرَأُ أَحَدُكُمْ خَمْسِينَ آيَةً قَبْلَ أَنْ يَرْفَعَ رَأْسَهُ، وَيَرْكَعُ رَكْعَتَيْنِ قَبْلَ صَلاَةِ الْفَجْرِ، ثُمَّ يَضْطَجِعُ عَلَى شِقِّهِ الأَيْمَنِ حَتَّى يَأْتِيَهُ الْمُؤَذِّنُ لِلصَّلاَةِ. [رواه البخاري: ٩٩٤]

**540.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ gecə namazını on bir rükət qılardı, bu namazlarda qıldığı hər bir səcdəni o qədər uzadardı ki, həmin vaxt ərzində sizin hər biriniz əlli ayə oxuya bilərdi və yalnız bundan sonra başını (səcdədən) qaldırardı, həmçinin sübh namazından əvvəl iki rükət (ratibə) namazı qılar və müəzzin gəlib onu namaza çağıranadək sağ böyrü üstə uzanardı. (əl-Buxari, 994)

## ٢– باب: سَاعَاتُ الْوِتْرِ

## 2-ci fəsil. Vitr (namazının) vaxtları

٥٤١ – عَنْهَا رضي الله عنها قَالَتْ: كُلَّ اللَّيْلِ أَوْتَرَ رَسُولُ اللَّهِ ﷺ وَانْتَهَى وِتْرُهُ إِلَى السَّحَرِ. [رواه البخاري: ٩٩٦]

**541.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ vitri gecənin müxtəlif saatlarında qılırdı. Son vaxtlar isə bu namazı sübh çağına yaxın bir vaxtda qılardı." (əl-Buxari, 996)

## ٣– باب: لِيَجْعَلْ آخِرَ صَلاَتِهِ وِتْرًا

## 3-cü fəsil. Vitri (gecə) qılınan namazların axırıncısı etmək gərəkdir

٥٤٢ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: «اجْعَلُوا آخِرَ صَلاَتِكُمْ بِاللَّيْلِ وِتْرًا». [رواه البخاري: ٩٩٨]

**542.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Elə edin ki, gecə qıldığınız namazların axırıncısı vitr olsun!" (əl-Buxari, 998)

## ٤– باب: الْوِتْرُ عَلَى الدَّابَّةِ

## 4-cü fəsil. Vitrin minik üstündə qılınması

٥٤٣ – عَنْهُ رضي الله عنهما قَالَ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يُوتِرُ عَلَى الْبَعِيرِ. [رواه البخاري: ٩٩٩]

**543.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ vitr namazını (hərdən) dəvənin üstündə qılardı. (əl-Buxari, 999)

## 5-ci fəsil. Rükudan əvvəl və ya sonra dua oxumaq[1]

## ٥– باب: الْقُنُوتُ قَبْلَ الرُّكُوعِ وَبَعْدَهُ

**٥٤٤** – عَنْ أَنَسٍ ؓ أَنَّهُ سُئِلَ: أَقَنَتَ النَّبِىُّ ﷺ فِى الصُّبْحِ؟ قَالَ: نَعَمْ. فَقِيلَ لَهُ: أَوَقَنَتَ قَبْلَ الرُّكُوعِ؟ قَالَ: بَعْدَ الرُّكُوعِ يَسِيرًا. [رواه البخاري: ١٠٠١]

**544.** Rəvayət edilir ki, Ənəsdən ؓ: "Peyğəmbər ﷺ sübh namazında (qunut) duası edərdimi?"– deyə soruşdular. (Ənəs): "Bəli!"– deyə cavab verdi. Ondan: "O, duanı rükudan qabaqmı edərdi?"– deyə soruşdular. (Ənəs) dedi: "O, bunu rükudan sonra, qısa bir müddətdə[2] etmişdi." (əl-Buxari, 1001)

**٥٤٥** – عَنْ أَنَسٍ ؓ أَنَّهُ سُئِلَ عَنِ الْقُنُوت، فَقَالَ: قَدْ كَانَ الْقُنُوتُ، فَقِيلَ لَهُ: قَبْلَ الرُّكُوعِ أَوْ بَعْدَهُ؟ قَالَ قَبْلَهُ. قِيلَ: فَإِنَّ فُلاَنًا أَخْبَرَ عَنْكَ أَنَّكَ قُلْتَ بَعْدَ الرُّكُوعِ. فَقَالَ كَذَبَ، إِنَّمَا قَنَتَ رَسُولُ اللَّهِ ﷺ بَعْدَ الرُّكُوعِ شَهْرًا، أُرَاهُ كَانَ بَعَثَ قَوْمًا يُقَالُ لَهُمُ الْقُرَّاءُ زُهَاءَ سَبْعِينَ رَجُلاً إِلَى قَوْمٍ مِنَ الْمُشْرِكِينَ دُونَ أُولَئِكَ، وَكَانَ بَيْنَهُمْ وَبَيْنَ رَسُولِ اللَّهِ ﷺ عَهْدٌ فَقَنَتَ رَسُولُ اللَّهِ ﷺ شَهْرًا يَدْعُو عَلَيْهِمْ. [رواه البخاري: ١٠٠٢]

– وَ فِي رِوَايَةٍ عَنْهُ ؓ قَالَ: قَنَتَ النَّبِيُّ ﷺ شَهْرًا يَدْعُو عَلَى رِعْلٍ وَ ذَكْوَانَ. [رواه البخاري: ١٠٠٣]

**545.** Rəvayət edilir ki, Ənəsdən ؓ qunut duası barəsində soruşdular. O: "(Bəli,) oxuyardılar"– deyə cavab verdi. Ondan: "Rükudan əvvəlmi, ya sonramı?"– deyə soruşdular. O: "Rükudan əvvəl"– deyə cavab verdi. Ona dedilər: "Bəs filankəs deyir ki, guya sən: "Rükudan sonra" demisən." (Ənəs) dedi: "O, yalan danışır. Peyğəmbər ﷺ rükudan sonra qunut duasını ancaq bir ay ərzində oxumuşdur. Bildiyimə görə Peyğəmbər ﷺ "Qurra"[3] adlanan yetmiş nəfəri müşriklərin yanına göndərmiş (və orada o qarilər qətlə yetirilmişlər). Halbuki müşriklərlə Peyğəmbər ﷺ arasında (bir-birlərinə qarşı silah çəkməyəcəklərinə dair) saziş bağlanmışdı. Elə bu səbəbdən də Peyğəmbər ﷺ düz bir ay onların əleyhinə dualar etdi. (əl-Buxari, 1002)

– Digər rəvayətdə Ənəs ؓ demişdir: "Peyğəmbər ﷺ bir ay ərzində Ril və Zəkəvan qəbilələrinin əleyhinə dua etmişdir." (əl-Buxari, 1003)

**٥٤٦** – عَنْهُ ؓ قَالَ: الْقُنُوتُ فِى الْمَغْرِبِ وَالْفَجْرِ . [رواه البخاري: ١٠٠٤]

**546.** Rəvayət edilir ki, Ənəs ؓ demişdir: "Qunut duası (çox vaxt) məğrib və sübh namazlarında oxunardu." (əl-Buxari, 1004)

---

[1] Namazın axırıncı rükətində oxunan bu duaya qunut deyilir.

[2] Burada qısa müddət deyildikdə, Peyğəmbərin ﷺ bir ay ərzində dua etməsi qəsd edilir. Bu, imam əl-Buxarinin rəvayət etdiyi (bu hədisdən sonra gələn 1002-ci) hədisdə öz əksini tapmışdır. Həmçinin qeyd etmək lazımdır ki, qunut duası həmişə deyil, arabir – yalnız zəruri hallarda oxunur. Əbu Hureyra ؓ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ yalnız kiminsə lehinə və ya əleyhinə dua etmək lazım gəldikdə qunut duası oxuyardı." Səhih ibn Xuzeymə, 620 və Səhih Hədislər Silsiləsi, 639.

[3] Qurra – ərəbcə qari sözünün cəmidir. Burada qari deyildikdə Quranı əzbər bilən əshabələr nəzərdə tutulur.

# ١٥ – كِتَابُ الاِسْتِسْقَاءِ

# 15 – İstisqa kitabı

## ١– باب: الاِسْتِسْقَاءُ

## 1-ci fəsil. İstisqa[1]

٥٤٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ زَيْدٍ ﵁ قَالَ: خَرَجَ النَّبِيُّ ﷺ يَسْتَسْقِي وَحَوَّلَ رِدَاءَهُ.
وَفِي رِوَايَةٍ عَنْهُ: وَصَلَّى رَكْعَتَيْنِ. [رواه البخاري: ١٠٠٥]

**547.** Rəvayət edilir ki, Abdullah ibn Zeyd ﵁ demişdir: "Peyğəmbər ﷺ (Allahdan) yağış diləmək üçün (namaz qılınan yerə) çıxdı və əbasını tərsinə çevirdi." (əl-Buxari, 1005)

Digər rəvayətdə: "...və iki rükət namaz qıldı"– demişdir.

## ٢– باب: دُعَاءُ النَّبِيِّ ﷺ: ﴿ اجْعَلْهَا عَلَيْهِمْ سِنِينَ كَسِنِي يُوسُفَ ﴾

## 2-ci fəsil. Peyğəmbərin ﷺ: "Onlara Yusufun zamanında göndərdiyin (qıtlıq və quraqlıq) illəri kimi illər göndər!"– deyə dua etməsi

٥٤٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرَّكْعَةِ الآخِرَةِ يَقُولُ: «اللَّهُمَّ أَنْجِ عَيَّاشَ بْنَ أَبِي رَبِيعَةَ، اللَّهُمَّ أَنْجِ سَلَمَةَ بْنَ هِشَامٍ، اللَّهُمَّ أَنْجِ الْوَلِيدَ بْنَ الْوَلِيدِ، اللَّهُمَّ أَنْجِ الْمُسْتَضْعَفِينَ مِنَ الْمُؤْمِنِينَ، اللَّهُمَّ اشْدُدْ وَطْأَتَكَ عَلَى مُضَرَ، اللَّهُمَّ اجْعَلْهَا سِنِينَ كَسِنِي يُوسُفَ». وَأَنَّ النَّبِيَّ ﷺ قَالَ: «غِفَارُ غَفَرَ اللَّهُ لَهَا، وَأَسْلَمُ سَالَمَهَا اللَّهُ». [رواه البخاري: ١٠٠٦]

**548.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ axırıncı rükətdə başını (rükudan) qaldırdıqdan sonra dua edib deyərdi: "Allahım, Ayyaş ibn Əbu Rəbiəni xilas et! Allahım, Sələmə ibn Hişamı xilas et! Allahım, Vəlid ibn Vəlidi xilas et! Allahım, möminlərdən zəif olanları xilas et! Allahım, Mudar qəbiləsinə olan əzabını şiddətləndir! Allahım, onlara Yusufun zamanında göndərdiyin yeddi (qıtlıq və quraqlıq) illəri kimi illər göndər!"

Peyğəmbər ﷺ dua edib deyərdi: "Allah Ğifar qəbiləsini bağışlasın! Allah Əsləm qəbiləsinə salamatlıq nəsib eləsin!" (əl-Buxari, 1006)

٥٤٩ – عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ﵁ قَالَ: إِنَّ النَّبِيَّ ﷺ لَمَّا رَأَى مِنَ النَّاسِ إِدْبَارًا قَالَ: «اللَّهُمَّ سَبْعٌ كَسَبْعِ يُوسُفَ». فَأَخَذَتْهُمْ سَنَةٌ حَصَّتْ كُلَّ شَيْءٍ حَتَّى أَكَلُوا الْجُلُودَ وَالْمَيْتَةَ وَالْجِيَفَ، وَيَنْظُرُ أَحَدُهُمْ إِلَى السَّمَاءِ فَيَرَى الدُّخَانَ مِنَ الْجُوعِ، فَأَتَاهُ أَبُو سُفْيَانَ فَقَالَ: يَا مُحَمَّدُ إِنَّكَ تَأْمُرُ بِطَاعَةِ اللَّهِ وَبِصِلَةِ الرَّحِمِ وَإِنَّ قَوْمَكَ قَدْ هَلَكُوا، فَادْعُ اللَّهَ لَهُمْ قَالَ اللَّهُ تَعَالَى ﴿ فَٱرْتَقِبْ يَوْمَ تَأْتِى ٱلسَّمَآءُ بِدُخَانٍ مُّبِينٍ ﴾ إِلَى قَوْلِهِ ﴿عَآئِدُونَ يَوْمَ نَبْطِشُ ٱلْبَطْشَةَ ٱلْكُبْرَىٰٓ ﴾ فَالْبَطْشَةُ يَوْمَ بَدْرٍ، وَقَدْ مَضَتِ الدُّخَانُ وَالْبَطْشَةُ وَاللِّزَامُ وَآيَةُ الرُّومِ. [رواه البخاري: ١٠٠٧]

**549.** Abdullah ibn Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ (bəzi) adamların (İslama) arxa çevirdiklərini gördükdə dua edib demişdir: "Allahım, onlara Yusufun za-

[1] İstisqa deyildikdə - yağışın yağması üçün dua edib Allaha yalvarmaq nəzərdə tutulur.

manında göndərdiyin yeddi (qıtlıq və quraqlıq) illəri kimi illər göndər!" Bunun ardınca onlara elə bir qıtlıq və quraqlıq üz verdi ki, hər şey məhv olub getdi, iş o yerə gəlib çatdı ki, onlar heyvan dərilərini, ölmüş heyvanları və iylənmiş cəmdəkləri yeməyə başladılar. Onlardan kimsə göyə baxdıqda aclıqdan gözünə tüstü-duman görünürdü. Onda Əbu Süfyan Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ey Muhəmməd! Sən bizə Allaha itaət etməyi, qohumluq əlaqələrini möhkəmləndirməyi buyurursan, lakin sənin həmqəbilələrin həlak olur. Onlar üçün Allaha dua et!" (Peyğəmbər ﷺ dua etdi və yağış yağdı, lakin onlar yenə öz küfrlərinə qayıtdılar.) Uca Allah buyurur: **"Sən göydən aşkar bir tüstü gələcəyi günü gözlə. O *tüstü ki,* insanları bürüyəcəkdir. Bu, ağrılı-acılı bir əzabdır. *Onlar:* "Ey Rəbbimiz! Bizi bu əzabdan qurtar, biz də iman gətirək"– deyəcəklər. Onlar necə öyüd-nəsihət eşidə bilərlər ki, artıq onlara açıq-aşkar bir peyğəmbər gəlsə də, onlar ondan üz çevirib: "Öyrədilmiş bir dəlidir!"– dedilər. Biz əzabı bir az sizdən uzaqlaşdırarıq, amma siz yenə *azğınlığa* qayıdacaqsınız. *Kafirləri* böyük bir müsibətlə yaxalayacağımız gün Biz *onlardan* intiqam alacağıq"**[1]. (Ayədəki) "*Kafirləri* böyük bir müsibətlə yaxalayacağımız gün" Bədr günüdür ki, artıq olub-keçmişdir. (Kafirlərin) qıtlıq və quraqlığa məruz qalması, böyük bir müsibətlə yaxalanması, əzabın onlar üçün daimiləşməsi və rumluların (farslara) qalib gəlməsi artıq olub-keçmişdir." (əl-Buxari, 1007)

### 3-cü fəsil. Quraqlıq vaxtı camaat imamdan xahiş edə bilər ki, o, yağışın yağması üçün (Allaha) dua etsin

### ٣– باب: سُؤَالُ النَّاسِ الإِمَامَ الاِسْتِسْقَاءَ إِذَا قَحَطُوا

٥٥٠ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: رُبَّمَا ذَكَرْتُ قَوْلَ الشَّاعِرِ وَأَنَا أَنْظُرُ إِلَى وَجْهِ النَّبِيِّ ﷺ يَسْتَسْقِي، فَمَا يَنْزِلُ حَتَّى يَجِيشَ كُلُّ مِيزَابٍ، وَهُوَ قَوْلُ أَبِي طَالِبٍ:

وَأَبْيَضَ يُسْتَسْقَى الْغَمَامُ بِوَجْهِهِ ثِمَالُ الْيَتَامَى عِصْمَةٌ لِلأَرَامِلِ

[رواه البخاري: ١٠٠٩]

**550.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Mən Peyğəmbərin ﷺ üzünə baxarkən şairin bu sözlərini xatırladım:

*Onun bəyaz üzüylə*[2] *diləyirlər yağışı,*
*Qəyyumudur yetimin, hamisidir dulların.*

Peyğəmbər ﷺ (Allahdan) yağış dilədikdən sonra (minbərdən) aşağı enənədək bütün novlar[3] şırhaşır axırdı.

(Ravi Abdullah ibn Dinar) demişdir: "Bu (şeir parçası) Əbu Talibin sözüdür." (əl-Buxari, 1009)

٥٥١ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رضي الله عنه أَنَّهُ كَانَ إِذَا قَحَطُوا اسْتَسْقَى بِالْعَبَّاسِ بْنِ عَبْدِ الْمُطَّلِبِ رضي الله عنه فَقَالَ: اللَّهُمَّ إِنَّا كُنَّا نَتَوَسَّلُ إِلَيْكَ بِنَبِيِّنَا فَتَسْقِينَا وَإِنَّا نَتَوَسَّلُ إِلَيْكَ بِعَمِّ نَبِيِّنَا فَاسْقِنَا، قَالَ فَيُسْقَوْنَ. [رواه البخاري: ١٠١٠]

---

[1] "əd-Duxan" surəsi, 10-16.
[2] Burada Peyğəmbərin ﷺ üzünün ağappaq olduğu qəsd edilir.
[3] Nov: su və s. axıtmaq üçün dəmirdən, ağacdan, daşdan və s-dən yarımdairə şəklində düzəldilmiş axıntı yoludur.

**551.** Rəvayət edilir ki, qıtlıq və quraqlıq üz verdikdə Ömər ibn Xəttab ﷺ Abbas ibn Abdul-Muttəlibin ﷺ vasitəsilə (Allahdan) yağmur diləyib: "Allahım, biz Peyğəmbərimizin ﷺ vasitəsilə Səndən yağmur diləyərdik, Sən də bizə yağmur endirərdin. İndi isə biz Peyğəmbərimizin ﷺ əmisinin vasitəsilə Səndən yağmur diləyirik, bizə yağmur endir!"– deyər, (Allah da) onlara yağmur nazil edərdi. (əl-Buxari, 1010)

## 4-cü fəsil. Mərkəzi məsciddə yağışın yağması üçün dua etmək

## ٤ – باب: الاِسْتِسْقَاءُ فِى الْمَسْجِدِ الْجَامِعِ

٥٥٢ – عَنْ أَنَسٍ ﷺ يَذْكُرُ أَنَّ رَجُلاً دَخَلَ يَوْمَ الْجُمُعَةِ مِنْ بَابٍ كَانَ وُجَاهَ الْمِنْبَرِ، وَرَسُولُ اللَّهِ ﷺ قَائِمٌ يَخْطُبُ فَاسْتَقْبَلَ رَسُولَ اللَّهِ ﷺ قَائِمًا فَقَالَ يَا رَسُولَ اللَّهِ، هَلَكَتِ الْمَوَاشِى وَانْقَطَعَتِ السُّبُلُ، فَادْعُ اللَّهَ يُغِيثُنَا. قَالَ فَرَفَعَ رَسُولُ اللَّهِ ﷺ يَدَيْهِ فَقَالَ: «اللَّهُمَّ اسْقِنَا، اللَّهُمَّ اسْقِنَا، اللَّهُمَّ اسْقِنَا». قَالَ أَنَسٌ ﷺ وَلاَ وَاللَّهِ مَا نَرَى فِى السَّمَاءِ مِنْ سَحَابٍ وَلاَ قَزَعَةً وَلاَ شَيْئًا، وَمَا بَيْنَنَا وَبَيْنَ سَلْعٍ مِنْ بَيْتٍ وَلاَ دَارٍ، قَالَ فَطَلَعَتْ مِنْ وَرَائِهِ سَحَابَةٌ مِثْلُ التُّرْسِ، فَلَمَّا تَوَسَّطَتِ السَّمَاءَ انْتَشَرَتْ ثُمَّ أَمْطَرَتْ. قَالَ وَاللَّهِ مَا رَأَيْنَا الشَّمْسَ سِتًّا، ثُمَّ دَخَلَ رَجُلٌ مِنْ ذَلِكَ الْبَابِ فِى الْجُمُعَةِ الْمُقْبِلَةِ، وَرَسُولُ اللَّهِ ﷺ قَائِمٌ يَخْطُبُ، فَاسْتَقْبَلَهُ قَائِمًا فَقَالَ يَا رَسُولَ اللَّهِ، هَلَكَتِ الأَمْوَالُ وَانْقَطَعَتِ السُّبُلُ، فَادْعُ اللَّهَ يُمْسِكْهَا، قَالَ فَرَفَعَ رَسُولُ اللَّهِ ﷺ يَدَيْهِ ثُمَّ قَالَ: «اللَّهُمَّ حَوَالَيْنَا وَلاَ عَلَيْنَا، اللَّهُمَّ عَلَى الآكَامِ وَالْجِبَالِ وَالآجَامِ وَالظِّرَابِ وَالأَوْدِيَةِ وَمَنَابِتِ الشَّجَرِ». قَالَ فَانْقَطَعَتْ وَخَرَجْنَا نَمْشِى فِى الشَّمْسِ. [رواه البخاري: ١٠١٣]

**552.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ cümə günü xütbə verərkən bir nəfər minbərin qarşısındakı qapıdan içəri daxil oldu və Peyğəmbərlə ﷺ üzbəüz durub dedi: "Ey Allahın elçisi, mal-qara məhv oldu, yollar bağlandı, Allaha dua et ki, bizə yağmur endirsin." Peyğəmbər ﷺ əllərini (göyə) qaldırıb dedi: "Allahım, bizə yağmur endir! Allahım, bizə yağmur endir! Allahım, bizə yağmur endir!"

Vallahi, (həmin an) biz göydə nə bir bulud, nə bir bulud parçası, nə də başqa bir şey görürdük. Bizimlə Səl dağının arasında nə bir ev, nə də bir koma vardı. (Bu vaxt) dağın arxasından qalxanabənzər bir bulud göründü. O gəlib göyün ortasına çatdıqdan sonra (ətrafa) yayıldı və yağış yağmağa başladı. Vallahi, altı gün biz günəşi görmədik. Növbəti cümə günü Peyğəmbər ﷺ xütbə verərkən (yenə) bir nəfər həmin qapıdan içəri daxil oldu və Peyğəmbərlə ﷺ üzbəüz durub dedi: "Ey Allahın elçisi, mallar zay oldu, yollar bağlandı. Allaha dua et ki, yağışı dayandırsın. Peyğəmbər ﷺ əllərini (göyə) qaldırıb dedi: "Allahım! (Yağışı) üstümüzə deyil, ətrafımıza yağdır. Allahım, təpələrə, dağlara, bağlara, yamaclara, vadilərə və ağac bitən yerlərə (yağdır)![1]"

Yağış kəsdi və biz günəşli havada (gəzişmək üçün) bayıra çıxdıq. (əl-Buxari, 1013)

## 5-ci fəsil. Cümə xütbəsində qibləyə deyil, başqa istiqamətə üz tutub yağışın yağması üçün dua etmək

## ٥ – باب: الاِسْتِسْقَاءُ فِى خُطْبَةِ الْجُمُعَةِ غَيْرَ مُسْتَقْبِلِ الْقِبْلَةِ

٥٥٣ – عَنْهُ ﷺ، فَرَفَعَ رَسُولُ اللَّهِ ﷺ يَدَيْهِ ثُمَّ قَالَ: «اللَّهُمَّ أَغِثْنَا، اللَّهُمَّ أَغِثْنَا، اللَّهُمَّ أَغِثْنَا». [رواه البخاري: ١٠١٤]

[1] Transkripsiyası: Allahummə həvaleynə və lə aleynə. Allahummə aləl-akəmi, vəl-cibali, vəl-acami, vəz-zırabi vəl-əvdiyəti və mənabitiş-şəcəri.

**553.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ əllərini göyə qaldırıb demişdir: "Allahım, bizə yağmur endir! Allahım, bizə yağmur endir! Allahım, bizə yağmur endir!" (əl-Buxari, 1014)

## ٦– باب: كَيْفَ حَوَّلَ النَّبِيُّ ﷺ ظَهْرَهُ إِلَى النَّاسِ

## 6-cı fəsil. Peyğəmbər ﷺ hansı şəkildə camaata arxa çevirmişdir?

**٥٥٤** – عَنْ عَبْدِ اللَّهِ بْنِ زَيْدٍ ﷺ قَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ يَوْمَ خَرَجَ يَسْتَسْقِى، فَحَوَّلَ إِلَى النَّاسِ ظَهْرَهُ، وَاسْتَقْبَلَ الْقِبْلَةَ يَدْعُو، ثُمَّ حَوَّلَ رِدَاءَهُ ، ثُمَّ صَلَّى لَنَا رَكْعَتَيْنِ جَهَرَ فِيهِمَا بِالْقِرَاءَةِ. [رواه البخاري: ١٠٢٤]

**554.** Rəvayət edilir ki, Abdullah ibn Zeyd ﷺ demişdir: "Mən Peyğəmbəri ﷺ istisqa namazını qılmaq üçün (namaz qılınan yerə) çıxdığı gün görmüşəm. O, dua etmək üçün arxasını camaata çevirib qibləyə üz tutduqdan sonra əbasını tərsinə çevirdi. Bundan sonra (camaata) iki rükət namaz qıldırdı və hər iki rükətdə (surələri və təkbirləri) uca səslə oxudu." (əl-Buxari, 1024)

## ٧– باب: رَفْعُ الإِمَامِ يَدَهُ فِى الاِسْتِسْقَاءِ

## 7-ci fəsil. İmamın yağışın yağması üçün dua edərkən əllərini göyə qaldırması

**٥٥٥** – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ كَانَ النَّبِيُّ ﷺ لاَ يَرْفَعُ يَدَيْهِ فِى شَىْءٍ مِنْ دُعَائِهِ إِلاَّ فِى الاِسْتِسْقَاءِ، وَإِنَّهُ يَرْفَعُ حَتَّى يُرَى بَيَاضُ إِبْطَيْهِ. [رواه البخاري: ١٠٣١]

**555.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ, yağış diləmək üçün dua etməsi istisna olmaqla, heç bir duasında əllərini (göyə) qaldırmazdı. O, (əllərini) qoltuqlarının altının ağlığı görünənədək yuxarı qaldırardı. (əl-Buxari, 1031)

## ٨– باب: مَا يُقَالُ إِذَا أَمْطَرَتْ

## 8-ci fəsil. Yağış yağanda nə deyilməlidir?

**٥٥٦** – عَنْ عَائِشَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا رَأَى الْمَطَرَ قَالَ: «صَيِّبًا نَافِعًا». [رواه البخاري: ١٠٣٢]

**556.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ yağış yağdığını görəndə deyərdi: "(Allahım,) bu yağışı faydalı et![1]" (əl-Buxari, 1032)

## ٩– باب: إِذَا هَبَّتِ الرِّيحُ

## 9-cu fəsil. Külək çox bərk əsdiyi zaman...

**٥٥٧** – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَتِ الرِّيحُ الشَّدِيدَةُ إِذَا هَبَّتْ عُرِفَ ذَلِكَ فِى وَجْهِ النَّبِىِّ ﷺ. [رواه البخاري: ١٠٣٤]

**557.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Külək çox bərk əsdiyi zaman onun vahiməsi Peyğəmbərin ﷺ üzündə hiss olunardı." (əl-Buxari, 1034)

---

[1] Transkripsiyası: Allahummə sayyibən nafian.

## 10-cu fəsil. Peyğəmbərin ﷺ: «Mən Səba qasırğası sayəsində qələbə qazandım»– sözü

## ١٠– باب: قَوْلُ النَّبِيِّ ﷺ: ﴿ نُصِرْتُ بِالصَّبَا ﴾

٥٥٨ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «نُصِرْتُ بِالصَّبَا، وَأُهْلِكَتْ عَادٌ بِالدَّبُورِ». [رواه البخاري: ١٠٣٥]

**558.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən Səba qasırğası sayəsində qələbə qazandım, Ad tayfası isə Dəbur qasırğası[1] ilə məhv edildi." (əl-Buxari, 1035)

## 11-ci fəsil. Zəlzələlər və müsibətlər barəsində deyilənlər

## ١١– باب: مَا قِيلَ فِى الزَّلاَزِلِ وَالآيَاتِ

٥٥٩ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «اللَّهُمَّ بَارِكْ لَنَا فِى شَامِنَا وَفِى يَمَنِنَا». قَالُوا: وَفِى نَجْدِنَا؟ قَالَ: «اللَّهُمَّ بَارِكْ لَنَا فِى شَامِنَا وَفِى يَمَنِنَا». قَالُوا: وَفِى نَجْدِنَا؟ قَالَ: «هُنَاكَ الزَّلاَزِلُ وَالْفِتَنُ، وَبِهَا يَطْلُعُ قَرْنُ الشَّيْطَانِ». [رواه البخاري: ١٠٣٧]

**559.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahım, Şamımızda və Yəmənimizdə bizə xeyir-bərəkət ver!" (Əshabələr) dedilər: "Bəs Nəcdimizdə?" O (yenə) dedi: "Allahım, Şamımızda və Yəmənimizdə bizə xeyir-bərəkət ver!" (Əshabələr yenə) dedilər: "Bəs Nəcdimizdə?" (Onda Peyğəmbər ﷺ) dedi: "Orada zəlzələlər və fəsadlar baş verəcək və oradan şeytanın buynuzu[2] çıxacaq." (əl-Buxari, 1037)

## 12-ci fəsil. Yağışın nə vaxt yağacağını Uca Allahdan başqa heç kəs bilməz

## ١٢– باب: لاَ يَدْرِى مَتَى يَجِيءُ الْمَطَرُ إِلاَّ اللَّه تَعَالَى

٥٦٠ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ: «مِفْتَاحُ الْغَيْبِ خَمْسٌ لاَ يَعْلَمُهَا إِلاَّ اللَّهُ لاَ يَعْلَمُ أَحَدٌ مَا يَكُونُ فِى غَدٍ، وَلاَ يَعْلَمُ أَحَدٌ مَا يَكُونُ فِى الأَرْحَامِ، وَلاَ تَعْلَمُ نَفْسٌ مَاذَا تَكْسِبُ غَدًا، وَمَا تَدْرِى نَفْسٌ بِأَىِّ أَرْضٍ تَمُوتُ، وَمَا يَدْرِى أَحَدٌ مَتَى يَجِيءُ الْمَطَرُ». [رواه البخاري: ١٠٣٩]

**560.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qeybin beş açarı vardır ki, bunları Allahdan başqa heç kəs bilə bilməz: "Heç kəs səhər nə baş verəcəyini bilə bilməz, heç kəs bətnlərdə olanı[3] bilməz, heç kəs səhər nə qazanacağını bilməz, heç kəs harada öləcəyini bilməz və heç kəs yağışın nə vaxt yağacağını bilməz"[4]. (əl-Buxari, 1039)

---

[1] Burada Səba deyildikdə şərq küləyi, Dəbur deyildikdə isə qərb küləyi qəsd edilir.

[2] Şeytanın buynuzu deyildikdə, ona uyanların meydana çıxması nəzərdə tutulur.

[3] Yəni heç kəs doğulacaq uşağın doqquz aydan tez və ya gec, oğlan, yaxud qız, xəstə və ya sağlam, xoşbəxt və ya bədbəxt, yaxşı və ya pis əməl sahibi olacağını bilmir.

[4] "Loğman" surəsinin 34-cü ayəsinə bax.

# ١٦ – كِتَابُ الْكُسُوفِ

# 16 – Kusuf[1] kitabı

## ١– باب: الصَّلاَةُ فِى كُسُوفِ الشَّمْسِ

## 1-ci fəsil. Günəş tutulduğu vaxt namaz qılmaq

٥٦١ – عَنْ أَبِى بَكْرَةَ ﷺ قَالَ: كُنَّا عِنْدَ رَسُولِ اللَّهِ ﷺ فَانْكَسَفَتِ الشَّمْسُ، فَقَامَ النَّبِىُّ ﷺ يَجُرُّ رِدَاءَهُ حَتَّى دَخَلَ الْمَسْجِدَ، فَدَخَلْنَا فَصَلَّى بِنَا رَكْعَتَيْنِ، حَتَّى انْجَلَتِ الشَّمْسُ فَقَالَ ﷺ: «إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ، فَإِذَا رَأَيْتُمُوهُمَا فَصَلُّوا، وَادْعُوا، حَتَّى يُكْشَفَ مَا بِكُمْ». [رواه البخاري: ١٠٤٠]
– وَعَنْهُ فِي رِوَايَةٍ: وَلَكِنَّ اللَّهَ تَعَالَى يُخَوِّفُ بِهَا عِبَادَهُ». [رواه البخاري: ١٠٤٨]

**561.** Rəvayət edilir ki, Əbu Bəkrə ﷺ demişdir: "Biz Peyğəmbərin ﷺ yanında olarkən günəş tutuldu. Peyğəmbər ﷺ dərhal qalxıb əbasını sürüyərək gedib məscidə daxil oldu. Biz də (onun arxasınca oraya) daxil olduq. Günəşin üzü açılanadək o, bizə iki rükət namaz qıldırdı. Sonra dedi: "Şübhə yoxdur ki, günəş və ay heç kəsin ölümünə görə tutulmur. Odur ki, günəşin və ayın tutulduğunu gördüyünüz zaman onların üzü açılanadək namaz qılın və Allaha dua edin!" (əl-Buxari, 1040)

Digər rəvayətdə deyilir: "... lakin Uca Allah bununla Öz qullarını qorxudur." (əl-Buxari, 1048)

– عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ﷺ قَالَ: كَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ يَوْمَ مَاتَ إِبْرَاهِيمُ، فَقَالَ النَّاسُ: كَسَفَتِ الشَّمْسُ لِمَوْتِ إِبْرَاهِيمَ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ، فَإِذَا رَأَيْتُمْ فَصَلُّوا وَادْعُوا اللَّهَ». [رواه البخاري: ١٠٤٣]

– Muğira ibn Şobə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ zamanında oğlu İbrahim vəfat etdiyi gün günəş tutuldu və insanlar: "Günəş İbrahimin ölümünə görə tutulmuşdur"– dedilər. Belə olduqda, Peyğəmbər ﷺ dedi: "Günəş və ay kimsənin nə ölümünə görə, nə də dünyaya gəldiyinə görə tutulur. (Onların tutulduğunu) gördüyünüz zaman namaz qılın və Allaha dua edin!" (əl-Buxari, 1043)

## ٢– باب: الصَّدَقَةُ فِى الْكُسُوفِ

## 2-ci fəsil. Kusuf vaxtı sədəqə vermək

٥٦٢ – عَنْ عَائِشَةَ ﷺ أَنَّهَا قَالَتْ: خَسَفَتِ الشَّمْسُ فِى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ فَصَلَّى رَسُولُ اللَّهِ ﷺ بِالنَّاسِ، فَقَامَ فَأَطَالَ الْقِيَامَ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ، ثُمَّ قَامَ فَأَطَالَ الْقِيَامَ وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ، وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ، ثُمَّ فَعَلَ فِى الرَّكْعَةِ الثَّانِيَةِ مِثْلَ مَا فَعَلَ فِى الأُولَى، ثُمَّ انْصَرَفَ وَقَدِ انْجَلَتِ الشَّمْسُ، فَخَطَبَ النَّاسَ، فَحَمِدَ اللَّهَ، وَأَثْنَى عَلَيْهِ ثُمَّ قَالَ: «إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللَّهِ، لاَ يَنْخَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَادْعُوا اللَّهَ وَكَبِّرُوا، وَصَلُّوا وَتَصَدَّقُوا». ثُمَّ

[1] Kusuf deyildikdə günəşin və ya ayın tutulması nəzərdə tutulur.

قَالَ: «يَا أُمَّةَ مُحَمَّدٍ، وَاللَّهِ مَا مِنْ أَحَدٍ أَغْيَرُ مِنَ اللَّهِ أَنْ يَزْنِيَ عَبْدُهُ أَوْ تَزْنِيَ أَمَتُهُ، يَا أُمَّةَ مُحَمَّدٍ، وَاللَّهِ لَوْ تَعْلَمُونَ مَا أَعْلَمُ لَضَحِكْتُمْ قَلِيلاً وَلَبَكَيْتُمْ كَثِيرًا». [رواه البخاري: ١٠٤٤]

**562.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ zamanında günəş tutuldu və buna görə də Peyğəmbər ﷺ camaata namaz qıldırdı. (Namazda) qiyamı[1] uzatdı, sonra rükuya getdi və rükunu uzatdı, sonra rükudan qalxdı və (yenə) qiyamı uzatdı, lakin bu qiyam əvvəlkindən qısa idi, sonra (bir də) rükuya getdi və rükunu uzatdı, lakin bu rüku əvvəlkindən qısa idi, sonra səcdəyə getdi və səcdəni uzatdı, ikinci rükətdə də birinci rükətdə elədiklərini təkrar etdi. Namazı bitirdikdə artıq günəşin üzü açılmışdı. Bundan sonra (qalxıb) xütbə verdi və Allaha həmd-səna edib təriflər deyəndən sonra buyurdu: “Həqiqətən də, günəş və ay Allahın dəlillərindəndir. Onlar kimsənin nə ölümünə görə, nə də dünyaya gəldiyinə görə tutulur. Odur ki, onların tutulduğunu gördüyünüz zaman Allaha dua edin, “Allahu Əkbər”– deyin, namaz qılın və sədəqə verin.” Sonra Peyğəmbər ﷺ davam edib dedi: “Ey Muhəmməd ümməti! Vallahi, kişi və ya qadın köləsinin zina etməsi xüsusunda heç kəs Allahdan daha qısqanc ola bilməz. Ey Muhəmməd ümməti! Vallahi, mən bildiyimi siz bilsəydiniz, az gülüb çox ağlayardınız.” (əl-Buxari, 1044)

## 3-cü fəsil. Kusuf vaxtı hamını camaat namazına çağırmaq

## ٣– باب: النِّدَاءُ بِالصَّلاَةُ جَامِعَةٌ فِي الْكُسُوفِ

٥٦٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﵄ قَالَ لَمَّا كَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ نُودِيَ إِنَّ الصَّلاَةَ جَامِعَةٌ. [رواه البخاري: ١٠٤٥]

**563.** Abdullah ibn Amr ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ zamanında günəş tutulduqda uca səslə deyilmişdi: “Camaat namazına (toplanın)!” (əl-Buxari, 1045)

## 4-cü fəsil. Kusuf vaxtı qəbir əzabından Allaha sığınmaq

## ٤– باب: التَّعَوُّذُ مِنْ عَذَابِ الْقَبْرِ فِي الْكُسُوفِ

٥٦٤ – عَنْ عَائِشَةَ ﵂ أَنَّ يَهُودِيَّةً جَاءَتْ تَسْأَلُهَا فَقَالَتْ لَهَا أَعَاذَكِ اللَّهُ مِنْ عَذَابِ الْقَبْرِ. فَسَأَلَتْ عَائِشَةُ ﵂ رَسُولَ اللَّهِ ﷺ أَيُعَذَّبُ النَّاسُ فِي قُبُورِهِمْ؟ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ عَائِذًا بِاللَّهِ مِنْ ذَلِكَ ثُمَّ رَكِبَ رَسُولُ اللَّهِ ﷺ ذَاتَ غَدَاةٍ مَرْكَبًا، فَخَسَفَتِ الشَّمْسُ، فَرَجَعَ ضُحًى، فَمَرَّ رَسُولُ اللَّهِ ﷺ بَيْنَ ظَهْرَانَيِ الْحُجَرِ، ثُمَّ قَامَ يُصَلِّي، وَقَامَ النَّاسُ وَرَاءَهُ، فَقَامَ قِيَامًا طَوِيلاً، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً، ثُمَّ رَفَعَ فَقَامَ قِيَامًا طَوِيلاً، وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً، وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ، ثُمَّ رَفَعَ فَسَجَدَ، ثُمَّ قَامَ فَقَامَ قِيَامًا طَوِيلاً، وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ، ثُمَّ قَامَ قِيَامًا طَوِيلاً وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ، ثُمَّ رَكَعَ

[1] 429-cu hədisin qeydlərinə bax.

رُكُوعًا طَوِيلاً وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ، ثُمَّ رَفَعَ فَسَجَدَ وَانْصَرَفَ، فَقَالَ مَا شَاءَ اللَّهُ أَنْ يَقُولَ، ثُمَّ أَمَرَهُمْ أَنْ يَتَعَوَّذُوا مِنْ عَذَابِ الْقَبْرِ. [رواه البخاري: ١٠٤٩-١٠٥٠]

**564.** Aişədən ﷺ rəvayət edilir ki, yəhudi bir qadın ondan kömək diləməyə gəldi və ona: "Allah səni qəbir əzabından qorusun"– dedi. Buna görə də Aişə ﷺ Peyğəmbərdən ﷺ: "İnsanlar qəbirlərində əzab çəkəcəklərmi?"– deyə soruşdu. Peyğəmbər ﷺ dedi: "Allah bizi bundan qorusun!"

(Aişə rəvayətinə davam edib demişdir:) "Bir dəfə səhər tezdən Peyğəmbər ﷺ öz dəvəsinə minib (bir qədər getdikdən sonra) günəş tutuldu və o, günortadan əvvəl geri döndü. Peyğəmbər ﷺ hücrələrin yanından keçib namaza durdu, camaat da onun arxasında namaza durdu. (Namazda) qiyamı uzatdı, sonra rükuya getdi və rükunu uzatdı, sonra rükudan qalxdı və (yenə) qiyamı uzatdı, lakin bu qiyam əvvəlkindən qısa idi, sonra (bir də) rükuya getdi və rükunu uzatdı, lakin bu rüku əvvəlkindən qısa idi, sonra (rükudan) qalxıb səcdəyə getdi (və iki dəfə səcdə qıldı). Sonra ayağa qalxıb qiyamı uzatdı, lakin bu qiyam əvvəlkindən qısa idi, sonra rükuya getdi və rükunu uzatdı, lakin bu rüku əvvəlkindən qısa idi, sonra rükudan qalxdı və (yenə) qiyamı uzatdı, lakin bu qiyam əvvəlkindən qısa idi, sonra (bir də) rükuya getdi və rükunu uzatdı, lakin bu rüku əvvəlkindən qısa idi, sonra (rükudan) qalxıb səcdəyə getdi, (iki dəfə səcdə qıldı) və (salamları verib) namazı bitirdi. Allahın istədiyi qədər (camaata) öyüd-nəsihət verdikdən sonra onlara qəbir əzabından Allaha sığınmağı əmr etdi. (əl-Buxari, 1049-1050)

## 5-ci fəsil. Kusuf namazını camaat şəklində qılmaq

## ٥- باب: صَلاَةُ الْكُسُوفِ جَمَاعَةً

٥٦٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: انْخَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ، فَصَلَّى رَسُولُ اللَّهِ ﷺ، فَقَامَ قِيَامًا طَوِيلاً نَحْوًا مِنْ قِرَاءَةِ سُورَةِ الْبَقَرَةِ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً، ثُمَّ رَفَعَ فَقَامَ قِيَامًا طَوِيلاً، وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً، وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ، ثُمَّ سَجَدَ، ثُمَّ قَامَ قِيَامًا طَوِيلاً وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً، وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ، ثُمَّ رَفَعَ فَقَامَ قِيَامًا طَوِيلاً، وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً، وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ، ثُمَّ سَجَدَ، ثُمَّ انْصَرَفَ وَقَدْ تَجَلَّتِ الشَّمْسُ، فَقَالَ ﷺ: «إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللَّهِ، لاَ يَخْسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَاذْكُرُوا اللَّهَ». قَالُوا يَا رَسُولَ اللَّهِ، رَأَيْنَاكَ تَنَاوَلْتَ شَيْئًا فِي مَقَامِكَ، ثُمَّ رَأَيْنَاكَ كَعْكَعْتَ. قَالَ ﷺ: «إِنِّي رَأَيْتُ الْجَنَّةَ ، فَتَنَاوَلْتُ عُنْقُودًا، وَلَوْ أَصَبْتُهُ لأَكَلْتُمْ مِنْهُ مَا بَقِيَتِ الدُّنْيَا، وَأُرِيتُ النَّارَ، فَلَمْ أَرَ مَنْظَرًا كَالْيَوْمِ قَطُّ أَفْظَعَ، وَرَأَيْتُ أَكْثَرَ أَهْلِهَا النِّسَاءَ». قَالُوا بِمَ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: «بِكُفْرِهِنَّ». قِيلَ يَكْفُرْنَ بِاللَّهِ؟ قَالَ: «يَكْفُرْنَ الْعَشِيرَ، وَيَكْفُرْنَ الإِحْسَانَ، لَوْ أَحْسَنْتَ إِلَى إِحْدَاهُنَّ الدَّهْرَ كُلَّهُ، ثُمَّ رَأَتْ مِنْكَ شَيْئًا قَالَتْ مَا رَأَيْتُ مِنْكَ خَيْرًا قَطُّ». [رواه البخاري: ١٠٥٢]

**565.** Rəvayət edilir ki, Abdullah ibn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ zamanında günəş tutuldu və bu səbəbdən də Peyğəmbər ﷺ (camaata) namaz qıldırdı. (Namazda) qiyamı o qədər uzatdı ki, (bu vaxt ərzində) "əl-Bəqərə" surəsini oxumaq olardı, sonra rükuya getdi və rükunu uzatdı, sonra rükudan qalxdı və qiyamı uzatdı, lakin bu qiyam əvvəlkindən qısa idi, sonra (bir də) rükuya getdi

və rükunu uzatdı, lakin bu rüku əvvəlkindən qısa idi, sonra (rükudan qalxıb səcdəyə getdi və iki dəfə) səcdə qıldı. Sonra ayağa qalxıb qiyamı uzatdı, lakin bu qiyam əvvəlkindən qısa idi, sonra rükuya getdi və rükunu uzatdı, lakin bu rüku əvvəlkindən qısa idi, sonra rükudan qalxdı və (yenə) qiyamı uzatdı, lakin bu qiyam əvvəlkindən qısa idi, sonra (bir də) rükuya getdi və rükunu uzatdı, lakin bu rüku əvvəlkindən qısa idi, sonra (rükudan qalxıb səcdəyə getdi və iki dəfə) səcdə qıldı, sonra (salamları verib) namazı bitirdi. Artıq günəşin üzü açılmışdı. Bundan sonra Peyğəmbər ﷺ buyurdu: "Həqiqətən də, günəş və ay Allahın dəlillərindəndir. Onlar kimsənin nə ölümünə görə, nə də dünyaya gəldiyinə görə tutulur. Odur ki, onların tutulduğunu gördüyünüz zaman Allahı zikr edin!" (Əshabələr) dedilər: "Ey Allahın elçisi, biz sənin dayandığın yerdə əlini uzadıb nə isə götürdüyünü, sonra da arxaya çəkildiyini gördük." Peyğəmbər ﷺ buyurdu: "Mən Cənnəti gördüm və (oradakı meyvələrdən) bir salxım dərmək istədim. Mən onu dərə bilsəydim, dünya durduqca siz ondan yeyə bilərdiniz. Həmçinin, Cəhənnəm də mənə göstərildi. Mən heç vaxt bu gün (gördüyüm) mənzərədən daha dəhşətlisini görməmişdim. Mən Cəhənnəm əhlinin əksəriyyətinin qadınlar olduğunu gördüm." (Camaat) soruşdu: "Nəyə görə, ya Rəsulullah?" O dedi: "Nankorluqlarına görə!" (Yenə) soruşdular: "Allaha qarşımı nankordurlar?" O dedi: "Onlar ərlərinə qarşı nankordurlar, yaxşılığı yerə vururlar. Birisinə il boyu yaxşılıq etsən, sonra da səndən (xoşuna gəlməyən) bir şey görsə, deyər: "Mən səndən heç vaxt xeyir görmədim." (əl-Buxari, 1052)

## ٦– باب: مَنْ أَحَبَّ الْعَتَاقَةَ فِى كُسُوفِ الشَّمْسِ

## 6-cı fəsil. Günəş tutulduğu vaxt kölə azad etməyi sevən kimsə haqqında

٥٦٦ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ رضي الله عنها قَالَتْ: لَقَدْ أَمَرَ النَّبِيُّ ﷺ بِالْعَتَاقَةِ فِى كُسُوفِ الشَّمْسِ. [رواه البخاري: ١٠٥٤]

**566.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ günəş tutulduğu zaman kölə azad etməyi əmr etmişdi."(əl-Buxari, 1054)

## ٧– باب: الذِّكْرُ فِى الْكُسُوفِ

## 7-ci fəsil. Kusuf vaxtı zikr etmək

٥٦٧ – عَنْ أَبِى مُوسَى رضي الله عنه قَالَ خَسَفَتِ الشَّمْسُ، فَقَامَ النَّبِيُّ ﷺ فَزِعًا، يَخْشَى أَنْ تَكُونَ السَّاعَةُ، فَأَتَى الْمَسْجِدَ، فَصَلَّى بِأَطْوَلِ قِيَامٍ وَرُكُوعٍ وَسُجُودٍ رَأَيْتُهُ قَطُّ يَفْعَلُهُ وَقَالَ: «هَذِهِ الآيَاتُ الَّتِى يُرْسِلُ اللَّهُ لاَ تَكُونُ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ، وَلَكِنْ يُخَوِّفُ اللَّهُ بِهِ عِبَادَهُ، فَإِذَا رَأَيْتُمْ شَيْئًا مِنْ ذَلِكَ فَافْزَعُوا إِلَى ذِكْرِهِ وَدُعَائِهِ وَاسْتِغْفَارِهِ». [رواه البخاري: ١٠٥٩]

**567.** Rəvayət edilir ki, Əbu Musa رضي الله عنه demişdir: "Günəş tutulduğu vaxt Peyğəmbər ﷺ qiyamət qopacağından qorxub təşviş içində ayağa qalxdı və məscidə gəlib namaz qıldı, mən heç vaxt onun (namazda) qiyamı, rükunu və səcdəni bu qədər uzatdığını görməmişdim. (Namazı bitirdikdən sonra) buyurdu: "Allahın göndərdiyi bu dəlillər heç kəsin nə ölümünə görə, nə də dünyaya gəldiyinə görə

olur. Fəqət, Allah bununla Öz qullarını qorxudur. Odur ki, belə bir şey gördükdə Allahı zikr etməyə, Ona dua etməyə və Ondan bağışlanma diləməyə tələsin!” (əl-Buxari, 1059)

## 8-ci fəsil. Kusuf namazını uca səslə oxumaq

## ٨– باب: الْجَهْرُ بِالْقِرَاءَةِ فِى الْكُسُوفِ

٥٦٨ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: جَهَرَ النَّبِىُّ ﷺ فِى صَلاَةِ الْخُسُوفِ بِقِرَاءَتِهِ، فَإِذَا فَرَغَ مِنْ قِرَاءَتِهِ كَبَّرَ فَرَكَعَ، وَإِذَا رَفَعَ مِنَ الرَّكْعَةِ قَالَ سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ، رَبَّنَا وَلَكَ الْحَمْدُ. ثُمَّ يُعَاوِدُ الْقِرَاءَةَ فِى صَلاَةِ الْكُسُوفِ، أَرْبَعَ رَكَعَاتٍ فِى رَكْعَتَيْنِ وَأَرْبَعَ سَجَدَاتٍ. [رواه البخاري: ١٠٦٥]

**568.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ Xusuf[1] namazında (oxuduğu surələri) uca səslə oxudu, (surələri) oxuyub qurtardıqdan sonra “Allahu Əkbər” deyib rükuya getdi, rükudan qalxarkən “Allah Ona həmd edəni eşitdi! Ey Rəbbimiz, Sənə həmd olsun![2]” dedi, sonra Kusuf namazında (surələri) yenə uca səslə oxudu. (Bu) iki rükətli namaz dörd rüku və dörd səcdədən ibarətdir. (əl-Buxari, 1065)

[1] Bu hədisdə xusuf və kusuf eyni mənanı verir.

[2] 425-ci hədisin qeydlərinə bax.

# ١٧ – كِتَابُ سُجُودُ القُرْآنِ

# 17 – Qurandakı səcdə ayələri kitabı

## ١– باب: مَا جَاءَ فِي سُجُودِ الْقُرْآنِ وَسُنَّتِهَا

## 1-ci fəsil. Qurandakı səcdə ayələri və onun sünnəsi haqqında varid olanlar

٥٦٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُود ﷺ قَالَ: قَرَأَ النَّبِيُّ ﷺ النَّجْمَ بِمَكَّةَ فَسَجَدَ فِيهَا، وَسَجَدَ مَنْ مَعَهُ، غَيْرَ شَيْخٍ أَخَذَ كَفًّا مِنْ حَصًى أَوْ تُرَابٍ فَرَفَعَهُ إِلَى جَبْهَتِهِ وَقَالَ يَكْفِينِي هَذَا، فَرَأَيْتُهُ بَعْدَ ذَلِكَ قُتِلَ كَافِرًا. [رواه البخاري: ١٠٦٧]

**569.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Peyğəmbər ﷺ Məkkədə ikən ən-Nəcm surəsini oxuyub səcdə etdi və onun yanındakılar da səcdə etdilər. Yalnız bir qoca kişidən başqa. O, (yerdən) bir ovuc xırda daş və ya torpaq götürüb onu alnına sürtdü və: "Bu mənə kifayət edər"– dedi. Bundan sonra mən onun kafir olaraq öldürüldüyünü gördüm. (əl-Buxari, 1067)

## ٢– باب: سَجْدَةِ ﴿ص﴾

## 2-ci fəsil. "Sad" surəsindəki səcdə ayəsi

٥٧٠ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: ﴿ص﴾ لَيْسَ مِنْ عَزَائِمِ السُّجُودِ، وَقَدْ رَأَيْتُ النَّبِيَّ ﷺ يَسْجُدُ فِيهَا. [رواه البخاري: ١٠٦٩]

**570.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "Sad surəsini oxuduqda səcdə etmək vacib deyil. Lakin mən Peyğəmbərin ﷺ bu surəni oxuyarkən səcdə etdiyini görmüşəm." (əl-Buxari, 1069)

## ٣– باب: سُجُودُ الْمُسْلِمِينَ مَعَ الْمُشْرِكِينَ وَالْمُشْرِكُ نَجَسٌ لَيْسَ لَهُ وُضُوءٌ

## 3-cü fəsil. Müsəlmanların müşriklərlə birlikdə səcdə etməsi; müşrik murdar olduğundan ona dəstəmaz almaq vacib deyildir

٥٧١ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ، أَنَّ النَّبِيَّ ﷺ سَجَدَ بِالنَّجْمِ وَسَجَدَ مَعَهُ الْمُسْلِمُونَ وَالْمُشْرِكُونَ وَالْجِنُّ وَالإِنْسُ. [رواه البخاري: ١٠٧١]

**571.** İbn Abbas ﷺ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ ən-Nəcm surəsini oxuyub səcdə etdi və onunla birlikdə müsəlmanlar və müşriklər, cinlər və insanlar da səcdə etdilər. (əl-Buxari, 1071)

**٤ – باب:**
**مَنْ قَرَأَ السَّجْدَةَ وَلَمْ يَسْجُدْ**

**4-cü fəsil.**
**Səcdə ayəsini oxuyub səcdə etməyən kimsə haqqında**

**٥٧٢** – عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ﷺ قَالَ: قَرَأْتُ عَلَى النَّبِيِّ ﷺ ﴿وَٱلنَّجْمِ﴾ فَلَمْ يَسْجُدْ فِيهَا. [رواه البخاري: ١٠٧٣]

**572.** Rəvayət edilir ki, Zeyd ibn Sabit ﷺ demişdir: "Mən Peyğəmbərə ﷺ "Ulduza and olsun!.."[1] surəsini oxudum, lakin o, səcdə etmədi." (əl-Buxari, 1073)

**٥ – باب:**
**سَجْدَةُ ﴿إِذَا ٱلسَّمَآءُ ٱنشَقَّتْ﴾**

**5-ci fəsil.**
**«Göy yarılacağı zaman»[2] surəsini oxuduqda səcdə etmək**

**٥٧٣** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّهُ قَرَأَ: ﴿إِذَا ٱلسَّمَآءُ ٱنشَقَّتْ﴾ فَسَجَدَ بِهَا. فَقِيلَ لَهُ فِي ذَلِكَ، قَالَ: لَوْ لَمْ أَرَ النَّبِيَّ ﷺ يَسْجُدُ لَمْ أَسْجُدْ. [رواه البخاري: ١٠٧٤]

**573.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ: «Göy yarılacağı zaman» surəsini oxuyub səcdə etdi. O (bu xüsusda) soruşulduqda dedi: "Əgər mən Peyğəmbərin ﷺ səcdə etdiyini görməsəydim, səcdə etməzdim." (əl-Buxari, 1074)

**٦ – باب:**
**مَنْ لَمْ يَجِدْ مَوْضِعًا لِلسُّجُودِ مِنَ الزِّحَامِ**

**6-cı fəsil.**
**İzdihamdan dolayı səcdə etmək üçün yer tapmayan kimsə**

**٥٧٤** – عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ يَقْرَأُ السُّورَةَ الَّتِي فِيهَا السَّجْدَةُ فَيَسْجُدُ وَنَسْجُدُ حَتَّى مَا يَجِدُ أَحَدُنَا مَكَانًا لِمَوْضِعِ جَبْهَتِهِ. [رواه البخاري: ١٠٧٩]

**574.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ içində səcdə ayəsi olan (hər hansı bir) surəni oxuyub səcdə edər və biz də onunla birlikdə səcdə edərdik. Hətta elə olurdu ki, bizlərdən bəzisi alnını qoymağa yer tapa bilmirdi." (əl-Buxari, 1079)

[1] Burada "ən-Nəcm" surəsi nəzərdə tutulur.
[2] Burada "əl-İnşiqaq" surəsinin 21-ci ayəsi nəzərdə tutulur.

# ١٨ – كِتَابُ تَقْصِيرُ الصَّلاةِ

# 18 – Namazı qısaltmaq kitabı

## ١– باب: مَا جَاءَ فِي التَّقْصِيرِ وَكَمْ يُقِيمُ حَتَّى يَقْصُرُ

## 1-ci fəsil. Namazı qısaltmaq haqqında və səfərdə (namazları) hansı müddətə qədər qısaltmaq olar

٥٧٥ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: أَقَامَ النَّبِيُّ ﷺ تِسْعَةَ عَشَرَ يَقْصُرُ، فَنَحْنُ إِذَا سَافَرْنَا تِسْعَةَ عَشَرَ قَصَرْنَا، وَإِنْ زِدْنَا أَتْمَمْنَا. [رواه البخاري: ١٠٨٠]

**575.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ on doqquz gün (səfərdə) qaldı və (bu əsnada namazları) qısaltdı." Biz də həmiçinin, on doqquz gün səfərdə qaldıqda (namazları) qısaldar, bundan artıq qaldıqda isə tam qılardıq. (əl-Buxari, 1080)

٥٧٦ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: خَرَجْنَا مَعَ النَّبِيِّ ﷺ مِنَ الْمَدِينَةِ إِلَى مَكَّةَ، فَكَانَ يُصَلِّي رَكْعَتَيْنِ رَكْعَتَيْنِ حَتَّى رَجَعْنَا إِلَى الْمَدِينَةِ. قُلْتُ أَقَمْتُمْ بِمَكَّةَ شَيْئًا قَالَ أَقَمْنَا بِهَا عَشْرًا. [رواه البخاري: ١٠٨١]

**576.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Mədinədən Məkkəyə yola düşdük. Peyğəmbər ﷺ Mədinəyə qayıdanadək namazları iki rükət-iki rükət qıldı."

(Yəhya ibn İshaq demişdir): "Mən (Ənəsdən رضي الله عنه) soruşdum: "Siz Məkkədə çoxmu qaldınız?" O dedi: "Biz orada on gün qaldıq." (əl-Buxari, 1081)

## ٢– باب: الصَّلاَةُ بِمِنًى

## 2-ci fəsil. Minada (qılınan) namazlar

٥٧٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: صَلَّيْتُ مَعَ النَّبِيِّ ﷺ بِمِنًى رَكْعَتَيْنِ، وَأَبِي بَكْرٍ رضي الله عنه وَعُمَرَ رضي الله عنه، وَمَعَ عُثْمَانَ رضي الله عنه صَدْرًا مِنْ إِمَارَتِهِ ثُمَّ أَتَمَّهَا. [رواه البخاري: ١٠٨٢]

**577.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Mən Minada Peyğəmbərlə ﷺ, Əbu Bəkrlə, Ömərlə, habelə Osmanla birlikdə – onun xilafətinin ilk illərində – namazı iki rükət qıldım. Sonralar Osman رضي الله عنه namazları tam qıldırdı. (əl-Buxari, 1082)

٥٧٨ – عَنْ حَارِثَةَ بْنِ وَهْبٍ رضي الله عنه قَالَ: صَلَّى بِنَا النَّبِيُّ ﷺ آمَنَ مَا كَانَ بِمِنًى رَكْعَتَيْنِ. [رواه البخاري: ١٠٨٣]

**578.** Rəvayət edilir ki, Harisə ibn Vəhb رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Minada, əmin-amanlıq olduğu bir vaxtda bizə iki rükət namaz qıldırdı. (əl-Buxari, 1083)

٥٧٩ – عَنْ ابْنِ مَسْعُودٍ رضي الله عنه لَمَّا قِيلَ لَهُ: صَلَّى بِنَا عُثْمَانُ بْنُ عَفَّانَ رضي الله عنه بِمِنًى أَرْبَعَ رَكَعَاتٍ، اسْتَرْجَعَ ثُمَّ قَالَ: صَلَّيْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ بِمِنًى رَكْعَتَيْنِ، وَصَلَّيْتُ مَعَ أَبِي بَكْرٍ رضي الله عنه بِمِنًى رَكْعَتَيْنِ، وَصَلَّيْتُ مَعَ عُمَرَ بْنِ الْخَطَّابِ رضي الله عنه بِمِنًى رَكْعَتَيْنِ، فَلَيْتَ حَظِّي مِنْ أَرْبَعِ رَكَعَاتٍ رَكْعَتَانِ مُتَقَبَّلَتَانِ. [رواه البخاري: ١٠٨٤]

**579.** Rəvayət edilir ki, Abdullah ibn Məsuda ﷺ dedilər: "Osman ibn Əffan ﷺ Minada bizə dörd rükət namaz qıldırdı." O (təəccüb edib): "Biz, Allaha məxsusuq və Ona da qayıdacağıq![1]"- dedikdən sonra buyurdu: "Mən Peyğəmbərlə ﷺ birlikdə Minada iki rükət namaz qılmışam, həmçinin Əbu Bəkrlə ﷺ birlikdə Minada iki rükət namaz qılmışam, habelə Ömər ibn Xəttabla ﷺ birlikdə Minada iki rükət namaz qılmışam. Dörd rükət qılmaqdansa, qəbul ounmuş iki rükət namaz qılmaq mənim üçün daha xoşdur." (əl-Buxari, 1084)

## 3-cü fəsil. Nə qədər məsafə (qət edildikdən sonra) namazları qısaltmaq olar

## ٣– باب: فِى كَمْ يَقْصُرُ الصَّلاَةَ؟

٥٨٠ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «لاَ يَحِلُّ لاِمْرَأَةٍ تُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ أَنْ تُسَافِرَ مَسِيرَةَ يَوْمٍ وَلَيْلَةٍ لَيْسَ مَعَهَا حُرْمَةٌ». [رواه البخاري: ١٠٨٨]

**580.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allaha və Axirət gününə iman gətirən qadına yanında bir məhrəmi[2] olmadan bir gün və bir gecəlik səfərə çıxmaq halal deyildir." (əl-Buxari, 1088)

## 4-cü fəsil. Səfərdə məğrib namazı üç rükət qılınmalıdır

## ٤– باب: يُصَلِّى الْمَغْرِبَ ثَلاَثًا فِى السَّفَرِ

٥٨١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ قَالَ: رَأَيْتُ النَّبِىَّ ﷺ إِذَا أَعْجَلَهُ السَّيْرُ يُؤَخِّرُ الْمَغْرِبَ، فَيُصَلِّيهَا ثَلاَثًا ثُمَّ يُسَلِّمُ، ثُمَّ قَلَّمَا يَلْبَثُ حَتَّى يُقِيمَ الْعِشَاءَ فَيُصَلِّيهَا رَكْعَتَيْنِ ثُمَّ يُسَلِّمُ، وَلاَ يُسَبِّحُ بَعْدَ الْعِشَاءِ حَتَّى يَقُومَ مِنْ جَوْفِ اللَّيْلِ. [رواه البخاري: ١٠٩١]

**581.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ (səfərdə) tələsik bir işi olduqda məğrib namazını gecikdirər, sonra da onu üç rükət qılıb salam verərdi, sonra o, işa namazını qılanadək bir qədər gözləyər və qalxıb bu namazı iki rükət qılıb salam verərdi, işa namazını qıldıqdan sonra gecə yarısı (namaza) duranadək namaz qılmazdı." (əl-Buxari, 1091)

٥٨٢ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ: أَنَّ النَّبِىَّ ﷺ كَانَ يُصَلِّى التَّطَوُّعَ وَهُوَ رَاكِبٌ فِى غَيْرِ الْقِبْلَةِ. [رواه البخاري: ١٠٩٤]

**582.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Peyğəmbər ﷺ (bəzən) nafilə namazlarını minik üzərində qibləyə tərəf deyil, (getdiyi istiqamətə tərəf üz tutub) qılardı." (əl-Buxari, 1094)

---

[1] Bu sözlər təəccüb doğuran bir şey gördükdə və ya hər hansı bir müsibət üz verdikdə deyilir. Əslində bu "əl-Bəqərə" surəsinin 156-cı ayəsidir. Ərəbcəsi: إِنَّا لِلَّهِ وَإِنَّا إِلَيْهِ رَاجِعُونَ

Transkripsiyası: İnnə lillahi və innə ileyhi raciun

[2] Yaxın qohum olduqlarına görə izdivacları şəriətlə haram və qadağan olan, buna görə də bir-birindən uzaq durması lazım gəlməyən qadın-qız və kişi.

## 5-ci fəsil. Eşşəyin üstündə nafilə namazı qılmaq haqqında

## ٥– باب: صَلاَةُ التَّطَوُّعِ عَلَى الْحِمَارِ

٥٨٣ – عَنْ أَنَسٍ ﷺ أَنَّهُ صَلَّى عَلَى حِمَارٍ وَوَجْهُهُ عَنْ يَسَارِ الْقِبْلَةِ، فَقِيْلَ لَهُ: تُصَلِّى لِغَيْرِ الْقِبْلَةِ؟ فَقَالَ: لَوْلاَ أَنِّى رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ فَعَلَهُ لَمْ أَفْعَلْهُ. [رواه البخاري: ١١٠٠]

**583.** Rəvayət edilir ki, Ənəs ﷺ eşşəyin üstündə ikən, qiblənin sol tərəfinə üz tutub namaz qıldı. Ona deyildi: "Sən qiblədən başqa tərəfə namaz qılırsan?!" O dedi: "Mən Peyğəmbərin ﷺ belə etdiyini görməsəydim, belə etməzdim." (əl-Buxari, 1100)

## 6-cı fəsil. Səfərdə (qıldığı vacib) namazlardan sonra nafilə namazı qılmayan kimsə haqqında

## ٦– باب: مَنْ لَمْ يَتَطَوَّعْ فِى السَّفَرِ دُبُرَ الصَّلاَةِ

٥٨٤ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: صَحِبْتُ النَّبِىَّ ﷺ فَلَمْ أَرَهُ يُسَبِّحُ فِى السَّفَرِ، وَقَالَ اللَّهُ جَلَّ ذِكْرُهُ: ﴿لَّقَدْ كَانَ لَكُمْ فِى رَسُولِ ٱللَّهِ أُسْوَةٌ حَسَنَةٌ﴾ [رواه البخاري: ١١٠١]

**584.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Mən (vaxtaşırı) Peyğəmbərlə ﷺ yol yoldaşı olmuşam və onun səfərdə (nafilə) namazı qıldığını görməmişəm. Tərifəlayiq Allah buyurur: **"Allahın elçisi sizlərə gözəl nümunədir"[1].** (əl-Buxari, 1101)

## 7-ci fəsil. Səfərdə (fərz) namazlarından əvvəl və ya başqa vaxtlarda nafilə namazları qılan kimsə haqqında

## ٧– باب: مَنْ تَطَوَّعَ فِى السَّفَرِ فِى غَيْرِ دُبُرِ الصَّلَوَاتِ وَقَبْلَهَا

٥٨٥ – عَنْ عَامِرِ بْنِ رَبِيعَةَ ﷺ، أَنَّهُ رَأَى النَّبِىَّ ﷺ صَلَّى السُّبْحَةَ بِاللَّيْلِ فِى السَّفَرِ عَلَى ظَهْرِ رَاحِلَتِهِ حَيْثُ تَوَجَّهَتْ بِهِ. [رواه البخاري: ١١٠٤]

**585.** Rəvayət edilir ki, Amir ibn Rabiə ﷺ Peyğəmbərin ﷺ səfərdə ikən dəvəsinin üstündə getdiyi istiqamətə tərəf üz tutub gecə (nafilə) namazı qıldığını görmüşdür. (əl-Buxari, 1104)

## 8-ci fəsil. Səfərdə (qılınan) məğrib və işa namazlarını birləşdirmək

## ٨– باب: الْجَمْعُ فِى السَّفَرِ بَيْنَ الْمَغْرِبِ وَالْعِشَاءِ

٥٨٦ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَجْمَعُ بَيْنَ صَلاَةِ الظُّهْرِ وَالْعَصْرِ إِذَا كَانَ عَلَى ظَهْرِ سَيْرٍ، وَيَجْمَعُ بَيْنَ الْمَغْرِبِ وَالْعِشَاءِ. [رواه البخاري: ١١٠٧]

[1] "əl-Əhzab" surəsi, 21.

**586.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ səfərdə olarkən zöhrlə əsr namazını, məğriblə də işa namazını birləşdirərdi. (əl-Buxari, 1107)

## 9-cu fəsil. Namazı oturulu halda qıla bilməyən kəs, onu uzanan yerdə qıla bilər

## ٩– باب: إِذَا لَمْ يُطِقْ قَاعِدًا صَلَّى عَلَى جَنْبٍ

٥٨٧ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ﷺ قَالَ، كَانَتْ بِي بَوَاسِيرُ فَسَأَلْتُ النَّبِيَّ ﷺ عَنِ الصَّلاَةِ فَقَالَ: «صَلِّ قَائِمًا، فَإِنْ لَمْ تَسْتَطِعْ فَقَاعِدًا، فَإِنْ لَمْ تَسْتَطِعْ فَعَلَى جَنْبٍ». [رواه البخاري: ١١١٧]

**587.** Rəvayət edilir ki, İmran ibn Husayn ﷺ demişdir: "Mən babasil[1] xəstəliyinə tutulmuşdum. Odur ki, Peyğəmbərdən ﷺ bu vəziyyətdə namaz qılmaq barəsində soruşdum. O dedi: "(Namazı) ayaq üstə qıl, bacarmırsansa oturan yerdə qıl, (bunu da) bacarmırsansa uzanan yerdə qıl." (əl-Buxari, 1117)

## 10-cu fəsil. Hər kim (halsız olduğundan) oturduğu yerdə namaza başladıqdan sonra halının yaxşılaşdığını və ya yüngülləşdiyini hiss etsə, (namazı) ayaq üstə tamamlamalıdır

## ١٠– باب: إِذَا صَلَّى قَاعِدًا ثُمَّ صَحَّ أَوْ وَجَدَ خِفَّةً تَمَّمَ مَا بَقِيَ

٥٨٨ – عَنْ عَائِشَةَ ﷺ أُمِّ الْمُؤْمِنِينَ أَنَّهَا لَمْ تَرَ رَسُولَ اللَّهِ ﷺ يُصَلِّي صَلاَةَ اللَّيْلِ قَاعِدًا قَطُّ حَتَّى أَسَنَّ، فَكَانَ يَقْرَأُ قَاعِدًا حَتَّى إِذَا أَرَادَ أَنْ يَرْكَعَ قَامَ، فَقَرَأَ نَحْوًا مِنْ ثَلاَثِينَ آيَةً أَوْ أَرْبَعِينَ آيَةً، ثُمَّ رَكَعَ. [رواه البخاري: ١١١٨]

**588.** Möminlərin anası Aişə ﷺ rəvayət edir ki, o, Peyğəmbərin ﷺ gecə namazını yaşa dolanadək oturduğu vəziyyətdə qıldığını görməmişdir. (Yaşlandıqda isə) o, oturmuş vəziyyətdə (namaza başlayıb) surələri oxuyar və rüku etmək istədikdə, ayağa qalxıb otuz və ya qırx ayə oxuduqdan sonra rüku edərdi. (əl-Buxari, 1118)

٥٨٩ – عَنْهَا ﷺ في رِوَايَة: ثُمَّ يَفْعَلُ فِي الرَّكْعَةِ الثَّانِيَةِ مِثْلَ ذَلِكَ، فَإِذَا قَضَى صَلاَتَهُ نَظَرَ، فَإِنْ كُنْتُ يَقْظَى تَحَدَّثَ مَعِي، وَإِنْ كُنْتُ نَائِمَةً اضْطَجَعَ. [رواه البخاري: ١١١٩]

**589.** Digər rəvayətdə əlavə edib demişdir: "... sonra ikinci rükətdə (birinci rükətdə) etdiklərini eyni ilə təkrar edərdi, namazı bitirdikdən sonra (mənə tərəf) baxardı, mən oyaq olsaydım, mənimlə söhbət edər, yatmış olsaydım, o da uzanıb yatardı." (əl-Buxari, 1119)

[1] Düz bağırsağın aşağı hissəsindəki qan damarlarının şişməsi nəticəsində tez-tez qanayan düyünlərin əmələ gəlməsindən ibarət xəstəlik.

# ١٩ – كِتَابُ التَّهَجُّدِ

# 19 – Gecənin bir vaxtı durub namaz qılmaq[1] kitabı

## ١ – باب: التَّهَجُّدُ بِاللَّيْلِ

## 1-ci fəsil. Gecənin bir vaxtı durub əlavə namaz qılmaq

٥٩٠ – عَنْ ابْنَ عَبَّاسٍ رضي الله عنهما قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا قَامَ مِنَ اللَّيْلِ يَتَهَجَّدُ قَالَ: «اللَّهُمَّ لَكَ الْحَمْدُ أَنْتَ قَيِّمُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ وَلَكَ الْحَمْدُ، لَكَ مُلْكُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ، وَلَكَ الْحَمْدُ أَنْتَ نُورُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ، وَلَكَ الْحَمْدُ أَنْتَ مَلِكُ السَّمَوَاتِ وَالأَرْضِ، وَلَكَ الْحَمْدُ أَنْتَ الْحَقُّ، وَوَعْدُكَ الْحَقُّ، وَلِقَاؤُكَ حَقٌّ، وَقَوْلُكَ حَقٌّ، وَالْجَنَّةُ حَقٌّ، وَالنَّارُ حَقٌّ، وَالنَّبِيُّونَ حَقٌّ، وَمُحَمَّدٌ ﷺ حَقٌّ، وَالسَّاعَةُ حَقٌّ، اللَّهُمَّ لَكَ أَسْلَمْتُ، وَبِكَ آمَنْتُ وَعَلَيْكَ تَوَكَّلْتُ، وَإِلَيْكَ أَنَبْتُ، وَبِكَ خَاصَمْتُ، وَإِلَيْكَ حَاكَمْتُ، فَاغْفِرْ لِي مَا قَدَّمْتُ وَمَا أَخَّرْتُ، وَمَا أَسْرَرْتُ وَمَا أَعْلَنْتُ، أَنْتَ الْمُقَدِّمُ وَأَنْتَ الْمُؤَخِّرُ، لاَ إِلَهَ إِلاَّ أَنْتَ أَوْ لاَ إِلَهَ غَيْرُكَ» [رواه البخاري: ١١٢٠]

**590.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ gecə durub nafilə namazı qıldıqda deyərdi: "Allahım, həmd yalnız Sənədir. Sən göylərin, yerin və onlarda olanların Hamisisən. Həmd yalnız Sənədir. Göylərin, yerin və onlarda olanların səltənəti Sənə məxsusdur. Həmd yalnız Sənədir. Sən göylərin, yerin və onlarda olanların nurusan. Həmd yalnız Sənədir. Sən göylərin və yerin Hökmdarısan. Həmd yalnız Sənədir. Sən Haqsan. Verdiyin vəd haqdır. Sənə qovuşmaq haqdır. Dediyin söz haqdır. Cənnət haqdır. Cəhənnəm haqdır. Peyğəmbərlər haqdır. Muhəmməd ﷺ haqdır. (Qiyamət) Saatı haqdır. Allahım! Sənə təslim oldum, Sənə iman gətirdim, Sənə təvəkkül etdim, tövbə edib Sənə döndüm, Sənin uğrunda mübarizə apardım və Sənin hökmünə üz tutdum. Əvvəl etdiyim, sonra edəcəyim, gizlin saxladığım və üzə çıxartdığım (pis) əməllərimi bağışla! Əvvələ çəkən də Sənsən, təxirə salan da Sənsən. (İbadətə layiq olan) məbud yalnız Sənsən və ya Səndən başqa (ibadətə layiq olan) məbud yoxdur"[2]. (əl-Buxari, 1120)

## ٢ – باب: فَضْلُ قِيَامِ اللَّيْلِ

## 2-ci fəsil. Gecə durub namaz qılmağın fəziləti

٥٩١ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: كَانَ الرَّجُلُ فِي حَيَاةِ النَّبِيِّ ﷺ إِذَا رَأَى رُؤْيَا قَصَّهَا عَلَى رَسُولِ اللَّهِ ﷺ فَتَمَنَّيْتُ أَنْ أَرَى رُؤْيَا فَأَقُصَّهَا عَلَى رَسُولِ اللَّهِ ﷺ وَكُنْتُ غُلاَمًا شَابًّا، وَكُنْتُ أَنَامُ فِي الْمَسْجِدِ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ

---

[1] Buna ərəbcə təhəccüd namazı deyilir.

[2] Transkripsiyası: Allahummə, ləkəl-həmdu əntə qayyimus-səməvati vəl-ardı və mən fihinnə, və ləkəl-həmdu ləkə mulkus-səməvati vəl-ardı və mən fihinnə, və ləkəl-həmdu əntə nurus-səməvati vəl-ardı və mən fihinnə, və ləkəl-həmdu əntə məlikus-səməvati vəl-ard, və ləkəl-həmdu, əntəl-həqqu, və va'dukəl-həqqu, və liqaukə həqqun, və qaulukə həqqun, vəl-Cənnətu həqqun, vən-Naru həqqun, vən-nəbiyyunə həqqun, və Muhəmmədun səllallahu aleyhi və səlləm həqqun, vəs-saatu həqqun, Allahummə, ləkə əsləmtu, və bikə aməntu, və aleykə təvəkkəltu və ileykə ənəbtu, və bikə xasəmtu, və ileykə hakəmtu, fəğfir li mə qaddəmtu və mə əxxartu və mə əsrərtu və mə ə'ləntu, əntəl-muqaddimu və əntəl-muəxxiru lə ilahə illə ənt, lə ilahə ğeyruk.

فَرَأَيْتُ فِى النَّوْمِ كَأَنَّ مَلَكَيْنِ أَخَذَانِى فَذَهَبَا بِى إِلَى النَّارِ فَإِذَا هِىَ مَطْوِيَّةٌ كَطَىِّ الْبِئْرِ، وَإِذَا لَهَا قَرْنَانِ، وَإِذَا فِيهَا أُنَاسٌ قَدْ عَرَفْتُهُمْ فَجَعَلْتُ أَقُولُ أَعُوذُ بِاللَّهِ مِنَ النَّارِ - قَالَ - فَلَقِيَنَا مَلَكٌ آخَرُ فَقَالَ لِى لَمْ تُرَعْ. فَقَصَصْتُهَا عَلَى حَفْصَةَ رضي الله عنها فَقَصَّتْهَا حَفْصَةُ رضي الله عنها عَلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: «نِعْمَ الرَّجُلُ عَبْدُ اللَّهِ، لَوْ كَانَ يُصَلِّى مِنَ اللَّيْلِ»، فَكَانَ بَعْدُ لاَ يَنَامُ مِنَ اللَّيْلِ إِلاَّ قَلِيلاً. [رواه البخاري: ١١٢١-١١٢٢]

**591.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: “Peyğəmbərin ﷺ sağlığında kimsə yuxu görəndə onu Peyğəmbərə ﷺ danışardı. Mən də istəyirdim ki, bir yuxu görüm və onu Peyğəmbərə ﷺ danışım. Peyğəmbərin ﷺ zamanında mən məsciddə yatırdım, özüm də cavan oğlan idim. Bir dəfə mən yuxuda iki mələyin məni tutub Cəhənnəmə tərəf apardıqlarını gördüm. Baxdım ki, Cəhənnəmin ətrafı (daşdan tikilmiş) su quyusu kimi hörülmüşdür. Bununla yanaşı onun iki dirəyi də var idi. Birdən mən onun içində tanıdığım adamları gördüm və: “Cəhənnəm odundan Allaha sığınıram!”– deməyə başladım. (Bu vaxt) qarşımıza bir mələk çıxıb mənə: “Qorxma!”– dedi. Mən bu yuxunu Həfsəyə danışdım, Həfsə də onu Peyğəmbərə ﷺ danışdı. O dedi: “Nə gözəl insandır Abdullah! Kaş ki, gecələr namaz qılaydı.”

(Səlim ibn Abdullah deyir ki,) bundan sonra o, gecələr çox az yatardı. (əl-Buxari, 1121-1122)

## 3-cü fəsil. Xəstənin gecə namazı qılmaması haqqında

## ٣- باب: تَرْكُ الْقِيَامِ لِلْمَرِيضِ

٥٩٢ – عَنْ جُنْدَبِ بْنِ عَبْدِ اللهِ رضي الله عنه قَالَ: اشْتَكَى النَّبِىُّ ﷺ فَلَمْ يَقُمْ لَيْلَةً أَوْ لَيْلَتَيْنِ. [رواه البخاري: ١١٢٤]

**592.** Cundəb ibn Abdullah رضي الله عنه rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ xəstələndi və buna görə də bir və ya iki gecə namaza durmadı. (əl-Buxari, 1124)

## 4-cü fəsil. Peyğəmbərin ﷺ (camaatı) gecə namazını, habelə digər nafilə namazlarını qılmağa təhrik etməsi və (bunu onlara) vacib buyurmaması haqqında

## ٤- باب: تَحْرِيضُ النَّبِىِّ ﷺ عَلَى صَلاَةِ اللَّيْلِ وَالنَّوَافِلِ مِنْ غَيْرِ إِيجَابٍ

٥٩٣ – عَنْ عَلِىِّ بْنِ أَبِى طَالِبٍ رضي الله عنه أَخْبَرَهُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ طَرَقَهُ وَفَاطِمَةَ بِنْتَ النَّبِىِّ ﷺ لَيْلَةً فَقَالَ: «أَلاَ تُصَلِّيَانِ». فَقُلْتُ يَا رَسُولَ اللَّهِ، أَنْفُسُنَا بِيَدِ اللَّهِ، فَإِذَا شَاءَ أَنْ يَبْعَثَنَا بَعَثَنَا. فَانْصَرَفَ حِينَ قُلْنَا ذَلِكَ وَلَمْ يَرْجِعْ إِلَىَّ شَيْئًا. ثُمَّ سَمِعْتُهُ وَهُوَ مُوَلٍّ يَضْرِبُ فَخِذَهُ وَهُوَ يَقُولُ: «وَكَانَ الإِنْسَانُ أَكْثَرَ شَىْءٍ جَدَلاً». [رواه البخاري: ١١٢٧

**593.** Rəvayət edilir ki, Əli ibn Əbu Talib رضي الله عنه demişdir: “Bir dəfə gecə Peyğəmbər ﷺ mənim və Peyğəmbərin ﷺ qızı Fatimənin yanına gəlib dedi: “Siz namaz qılmırsınızmı?” Mən dedim: “Ya Rəsulullah, bizim canımız Allahın Əlindədir. Əgər O, bizi oyatmaq istəsə, oyadar.” Belə deyəndə o, mənə heç bir söz deməyib çı-

xıb getdi. Sonra mən onun dönüb gedərkən ombasına vura-vura: “İnsan necə də çox mübahisə edərmiş!” [1]– dediyini eşitdim.” (əl-Buxari, 1127)

٥٩٤ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: إِنْ كَانَ رَسُولُ اللَّهِ ﷺ لَيَدَعُ الْعَمَلَ وَهُوَ يُحِبُّ أَنْ يَعْمَلَ بِهِ خَشْيَةَ أَنْ يَعْمَلَ بِهِ النَّاسُ فَيُفْرَضَ عَلَيْهِمْ، وَمَا سَبَّحَ رَسُولُ اللَّهِ ﷺ سُبْحَةَ الضُّحَى قَطُّ، وَإِنِّي لأُسَبِّحُهَا. [رواه البخاري: ١١٢٨]

**594.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Peyğəmbərin ﷺ yerinə yetirmək istədiyi elə əməllər var idi ki, o, insanların bu əməlləri yerinə yetirdikdən sonra bunun onlara da fərz buyurulacağından ehtiyat etdiyindən həmin əməlləri tərk edərdi. Peyğəmbər ﷺ heç vaxt duha namazını qılmayıb[2], mən isə bu namazı qılıram.”(əl-Buxari, 1128)

## ٥ – باب: قِيَامُ النَّبِيِّ ﷺ حَتَّى تَرِمَ قَدَمَاهُ

## 5-ci fəsil. Peyğəmbər ﷺ gecə namazında o qədər durardı ki, hətta ayaqları şişərdi

٥٩٥ – عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ﵁ يَقُولُ إِنْ كَانَ النَّبِيُّ ﷺ لَيَقُومُ لِيُصَلِّيَ حَتَّى تَرِمُ قَدَمَاهُ أَوْ سَاقَاهُ، فَيُقَالُ لَهُ فَيَقُولُ: «أَفَلاَ أَكُونُ عَبْدًا شَكُورًا». [رواه البخاري: ١١٣٠]

**595.** Muğira ibn Şobə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə namazlarını qılarkən o qədər ayaq üstə durardı ki, hətta, ayaqları və ya baldırları şişərdi. Ona (nə üçün özünə bu qədər əziyyət verirsən) deyildikdə, o deyərdi: “Şükür edən bir qul olmayımmı?!” (əl-Buxari, 1130)

## ٦ – باب: مَنْ نَامَ عِنْدَ السَّحَرِ

## 6-cı fəsil. Gecənin axırında yatan kimsə haqqında

٥٩٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ الْعَاصِ ﵄ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ لَهُ: «أَحَبُّ الصَّلاَةِ إِلَى اللَّهِ صَلاَةُ دَاوُدَ ﵇ وَأَحَبُّ الصِّيَامِ إِلَى اللَّهِ صِيَامُ دَاوُدَ، وَكَانَ يَنَامُ نِصْفَ اللَّيْلِ وَيَقُومُ ثُلُثَهُ وَيَنَامُ سُدُسَهُ، وَيَصُومُ يَوْمًا وَيُفْطِرُ يَوْمًا». [رواه البخاري: ١١٣١]

**596.** Abdullah ibn Amr ibn As ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ ona demişdir: “Allahın ən çox xoşuna gələn namaz Davudun ﵇ qıldığı namaz, ən çox xoşuna gələn oruc isə Davudun tutduğu orucdur. Davud gecənin yarısını yatar, sonra qalxıb onun üçdə birini namaz qılar, sonra da yerdə qalan altıda birini yatardı. Orucu da günaşırı tutardı.” (əl-Buxari, 1131)

٥٩٧ – عَنْ مَسْرُوقٍ قَالَ: سَأَلْتُ عَائِشَةَ ﵂ أَيُّ الْعَمَلِ كَانَ أَحَبَّ إِلَى النَّبِيِّ ﷺ قَالَتِ الدَّائِمُ. قُلْتُ مَتَى كَانَ يَقُومُ قَالَتْ يَقُومُ إِذَا سَمِعَ الصَّارِخَ. [رواه البخاري: ١١٣٢]

---

[1] “əl-Kəhf” surəsi, 54.

[2] Aişə ﵂ ya Peyğəmbərin ﷺ duha namazını qıldığını görməmişdir, ya da onun bu namazı davamiyyətli olaraq qılmadığını qəsd etmişdir.

**597.** Məsruq rəvayət edir ki, mən Aişədən ﵂: “Peyğəmbərin ﷺ ən çox sevdiyi əməl hansı (əməl) idi?”– deyə soruşdum. O: “Davamlı olan (əməllər)”– deyə cavab verdi. Mən soruşdum: “(Peyğəmbər ﷺ gecə namazını qılmaq üçün) nə vaxt yuxudan oyanardı?” Dedi: “Xoruzun səsini eşidəndə durardı.” (əl-Buxari, 1132)

**٥٩٨** – وِ فِي رِوَايَةٍ عَنْهَا ﵂ قَالَتْ: إِذَا سَمِعَ الصَّارِخَ قَامَ فَصَلَّى.

**598.** Digər rəvayətdə Aişə ﵂ demişdir: “Xoruzun səsini eşidəndə durub namaz qılardı.” (əl-Buxari, 1132)

**٥٩٩** – وِ فِي رِوَايَةٍ عَنْهَا ﵂ قَالَتْ: مَا أَلْفَاهُ السَّحَرُ عِنْدِى إِلاَّ نَائِمًا، تَعْنِى النَّبِيَّ ﷺ. [رواه البخاري: ١١٣٣]

**599.** Başqa bir rəvayətdə Aişə ﵂ Peyğəmbəri ﷺ qəsd edib demişdir: “O, mənim yanımda yatmış ikən səhər açılardı.” (əl-Buxari, 1133)

## 7-ci fəsil. Gecə namazını qılarkən qiyamı[1] uzatmaq

## ٧– باب: طُولُ الْقِيَامِ فِى صَلاَةِ اللَّيْلِ

**٦٠٠** – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُود ﵁ قَالَ: صَلَّيْتُ مَعَ النَّبِيِّ ﷺ لَيْلَةً، فَلَمْ يَزَلْ قَائِمًا حَتَّى هَمَمْتُ بِأَمْرِ سَوْءٍ. قُلْنَا وَمَا هَمَمْتَ قَالَ: هَمَمْتَ أَنْ أَقْعُدَ وَأَذَرَ النَّبِيَّ ﷺ. [رواه البخاري: ١١٣٥]

**600.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﵁ demişdir: “Bir gecə mən Peyğəmbərlə ﷺ birlikdə namaz qıldım. O, qiyamı o qədər uzatdı ki, hətta, mən pis bir iş görmək istədim.” Biz: “O nə iş idi?”– deyə soruşduq. O dedi: “İstədim yerə oturum və Peyğəmbəri ﷺ ayaq üstə buraxım.” (əl-Buxari, 1135)

## 8-ci fəsil. Peyğəmbərin ﷺ təhəccüd namazını necə və neçə rükət qılması haqqında

## ٨– باب: كَيْفَ كَانَ صَلاَةُ النَّبِيِّ ﷺ وَكَمْ كَانَ النَّبِيُّ ﷺ يُصَلِّى مِنَ اللَّيْلِ

**٦٠١** – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ كَانَ صَلاَةُ النَّبِيِّ ﷺ ثَلاَثَ عَشْرَةَ رَكْعَةً، يَعْنِى بِاللَّيْلِ. [رواه البخاري: ١١٣٨]

**601.** Rəvayət edilir ki, ibn Abbas ﵄ gecə qılınan nafilə namazlarını nəzərdə tutub demişdir: “Peyğəmbərin ﷺ namazı on üç rükətdən ibarət idi.” (əl-Buxari, 1138)

**٦٠٢** – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ كَانَ النَّبِيُّ ﷺ يُصَلِّى مِنَ اللَّيْلِ ثَلاَثَ عَشْرَةَ رَكْعَةً مِنْهَا الْوِتْرُ وَرَكْعَتَا الْفَجْرِ. [رواه البخاري: ١١٤٠]

**602.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ gecə on üç rükət namaz qılardı, vitr namazı və sübh namazının sünnəti də buna daxil idi.” (əl-Buxari, 1140)

[1] 429-cu hədisin qeydlərinə bax.

## 9-cu fəsil. Peyğəmbərin ﷺ gecə namaza durması, habelə yatması və bir də gecə namazının (hökmünün) nəsx olunması[1] haqqında

## ٩– باب: قِيَامُ النَّبِيِّ ﷺ بِاللَّيْلِ وَنَوْمِهِ وَمَا نُسِخَ مِنْ قِيَامِ اللَّيْلِ

٦٠٣ – عَنْ أَنَسٍ ﷺ يَقُولُ كَانَ رَسُولُ اللَّهِ ﷺ يُفْطِرُ مِنَ الشَّهْرِ حَتَّى نَظُنَّ أَنْ لاَ يَصُومَ مِنْهُ، وَيَصُومُ حَتَّى نَظُنَّ أَنْ لاَ يُفْطِرَ مِنْهُ شَيْئًا، وَكَانَ لاَ تَشَاءُ أَنْ تَرَاهُ مِنَ اللَّيْلِ مُصَلِّيًا إِلاَّ رَأَيْتَهُ وَلاَ نَائِمًا إِلاَّ رَأَيْتَهُ. [رواه البخاري: ١١٤١]

**603.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Peyğəmbər ﷺ bir ay ərzində o vaxta qədər oruc tutmazdı ki, hətta, biz onun həmin ay oruc tutmayacağını zənn edərdik, habelə bir ay ərzində o qədər oruc tutardı ki, biz onun həmin ay ardıcıl oruc tutacağını güman edərdik. Gecələr onun namaz qıldığını görmək istəsəydin, mütləq görərdin, həmçinin onun yatdığını görmək istəsəydin, mütləq görərdin. (əl-Buxari, 1141)

## 10-cu fəsil. (Hər kəs) gecə namazını qılanadək şeytanın onun boynunun ardına vurduğu düyünlər açılmır

## ١٠– باب: عَقْدُ الشَّيْطَانِ عَلَى قَافِيَةِ الرَّأْسِ إِذَا لَمْ يُصَلِّ بِاللَّيْلِ

٦٠٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «يَعْقِدُ الشَّيْطَانُ عَلَى قَافِيَةِ رَأْسِ أَحَدِكُمْ إِذَا هُوَ نَامَ ثَلاَثَ عُقَدٍ، يَضْرِبُ كُلَّ عُقْدَةٍ عَلَيْكَ لَيْلٌ طَوِيلٌ فَارْقُدْ، فَإِنِ اسْتَيْقَظَ فَذَكَرَ اللَّهَ انْحَلَّتْ عُقْدَةٌ، فَإِنْ تَوَضَّأَ انْحَلَّتْ عُقْدَةٌ، فَإِنْ صَلَّى انْحَلَّتْ عُقْدَةٌ فَأَصْبَحَ نَشِيطًا طَيِّبَ النَّفْسِ، وَإِلاَّ أَصْبَحَ خَبِيثَ النَّفْسِ كَسْلاَنَ». [رواه البخاري: ١١٤٢]

**604.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizlərdən biri yatdığı zaman şeytan onun boynunun ardına üç düyün vurur və hər düyün vurduqca[2]: "Gecə uzundur, yat!"– (deyir). Əgər o kimsə oyanıb Allahı zikr etsə, düyünlərdən biri açılar, dəstəmaz alsa, ikincisi açılar, namaz qılsa, üçüncüsü açılar və beləliklə də o adam səhər gümrah və əhvali-ruhiyyəsi yaxşı olduğu halda yuxudan oyanar. Əks halda isə o, əhvali-ruhiyyəsi çox pis, özü də əzgin halda yuxudan oyanar. (əl-Buxari, 1142)

## 11-ci fəsil. Kim namaz qılmayıb yatarsa, şeytan onun qulağına sidik ifraz edər

## ١١– باب: إِذَا نَامَ وَلَمْ يُصَلِّ بَالَ الشَّيْطَانُ فِي أُذُنِهِ

٦٠٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: ذُكِرَ عِنْدَ النَّبِيِّ ﷺ رَجُلٌ فَقِيلَ مَا زَالَ نَائِمًا حَتَّى أَصْبَحَ مَا قَامَ إِلَى الصَّلاَةِ. فَقَالَ: «بَالَ الشَّيْطَانُ فِي أُذُنِهِ». [رواه البخاري: ١١٤٤]

---

[1] "əl-Muzzəmmil" surəsinin 1-ci, 2-ci-, 3-cü, 4-cü və 20-ci ayələrinə bax.

[2] Şeytan bunu belə edir ki, düyünlər möhkəm olsun və ya yatmış insan heç bir şey hiss eləməsin.

**605.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Peyğəmbərin ﷺ yanında bir adam haqqında söhbət açıldı və: "O, səhərə qədər yatıb, heç namaza da qalxmayıb"– deyildi. (Peyğəmbər ﷺ) buyurdu: "Şeytan onun qulağına sidik ifraz etmişdir." (əl-Buxari, 1144)

## 12-ci fəsil. Gecənin axırında dua etmək və namaz qılmaq

## ١٢– باب: الدُّعَاءُ وَالصَّلاَةُ مِنْ آخِرِ اللَّيْلِ

٦٠٦ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: يَنْزِلُ رَبُّنَا تَبَارَكَ وَتَعَالَى كُلَّ لَيْلَةٍ إِلَى السَّمَاءِ الدُّنْيَا حِينَ يَبْقَى ثُلُثُ اللَّيْلِ الآخِرُ يَقُولُ مَنْ يَدْعُونِى فَأَسْتَجِيبَ لَهُ مَنْ يَسْأَلُنِى فَأُعْطِيَهُ مَنْ يَسْتَغْفِرُنِى فَأَغْفِرَ لَهُ. [رواه البخاري: ١١٤٥]

**606.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Uca və Ulu Rəbbimiz hər gecənin axır üçdə birində dünya səmasına enir və buyurur: "Kim Mənə dua edir ki, Mən də onun duasını qəbul edim?! Kim Məndən diləyir ki, Mən də ona dilədiyini verim?! Kim Məndən bağışlanma diləyir ki, Mən də onu bağışlayım?!" (əl-Buxari, 1145)

## 13-cü fəsil. Gecənin əvvəlini yatıb axırını oyaq qalan kimsə haqqında

## ١٣– باب: مَنْ نَامَ أَوَّلَ اللَّيْلِ وَأَحْيَا آخِرَهُ

٦٠٧ – عَنْ عَائِشَةَ ﷺ أَنَّهَا سُئِلَتْ: كَيْفَ كَانَتْ صَلاَةُ النَّبِىِّ ﷺ بِاللَّيْلِ قَالَتْ كَانَ يَنَامُ أَوَّلَهُ وَيَقُومُ آخِرَهُ، فَيُصَلِّى ثُمَّ يَرْجِعُ إِلَى فِرَاشِهِ، فَإِذَا أَذَّنَ الْمُؤَذِّنُ وَثَبَ، فَإِنْ كَانَ بِهِ حَاجَةٌ اغْتَسَلَ، وَإِلاَّ تَوَضَّأَ وَخَرَجَ. [رواه البخاري: ١١٤٦]

**607.** Rəvayət edilir ki, (bir dəfə) Aişədən ﷺ soruşdular: "Peyğəmbər ﷺ gecə namazını necə qılardı?" Dedi: "Gecənin əvvəlində yatar, axırında qalxıb namaz qılar, sonra yenidən yatağına uzanardı. Müəzzin azan verdiyi zaman qalxar və lazım gələrdisə qüsl edər, yoxsa dəstəmaz alıb (namaza) çıxardı." (əl-Buxari, 1146)

## 14-cü fəsil. Peyğəmbərin ﷺ ramazanda və başqa aylarda qıldığı gecə namazları

## ١٤– باب: قِيَامُ النَّبِىِّ ﷺ بِاللَّيْلِ فِى رَمَضَانَ وَغَيْرِهِ

٦٠٨ – عَنْ عَائِشَةَ ﷺ أَنَّهَا سُئِلَتْ: كَيْفَ كَانَتْ صَلاَةُ رَسُولِ اللَّهِ ﷺ فِى رَمَضَانَ فَقَالَتْ مَا كَانَ رَسُولُ اللَّهِ ﷺ يَزِيدُ فِى رَمَضَانَ وَلاَ فِى غَيْرِهِ عَلَى إِحْدَى عَشْرَةَ رَكْعَةً ، يُصَلِّى أَرْبَعًا فَلاَ تَسَلْ عَنْ حُسْنِهِنَّ وَطُولِهِنَّ، ثُمَّ يُصَلِّى أَرْبَعًا فَلاَ تَسَلْ عَنْ حُسْنِهِنَّ وَطُولِهِنَّ، ثُمَّ يُصَلِّى ثَلاَثًا، قَالَتْ عَائِشَةُ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ أَتَنَامُ قَبْلَ أَنْ تُوتِرَ. فَقَالَ: «يَا عَائِشَةُ، إِنَّ عَيْنَىَّ تَنَامَانِ وَلاَ يَنَامُ قَلْبِى». [رواه البخاري: ١١٤٧]

**608.** Rəvayət edilir ki, (bir dəfə) Aişədən ﷺ: "Peyğəmbər ﷺ ramazan ayında necə namaz qılardı?"– deyə soruşdular. O dedi: "Peyğəmbər ﷺ nə ramazanda, nə də

başqa bir ayda (gecələr) on bir rükətdən artıq namaz qılmazdı, (əvvəlcə) dörd rükət qılardı ki, bu rükətlərin (necə) gözəl və (nə qədər) uzun olduğu barədə heç soruşma. Sonra (yenə) dörd rükət qılardı ki, bu rükətlərin (necə) gözəl və (nə qədər) uzun olduğu barədə heç soruşma. Sonra da üç rükət qılardı."

Aişə ﵂ davam edib dedi: "Mən: "Ey Allahın elçisi, vitr namazını qılmamış yatırsan?"– deyə soruşdum. O buyurdu: "Ey Aişə, mənim gözlərim yatsa da, qəlbim yatmır." (əl-Buxari, 1147)

## 15-ci fəsil. Əldən düşənədək ibadət etmək bəyənilmir

## ١٥– باب: مَا يُكْرَهُ مِنَ التَّشْدِيدِ فِي الْعِبَادَةِ

٦٠٩ – عَنْ أَنَسِ بْنِ مَالِك ﵁ قَالَ دَخَلَ النَّبِيُّ ﷺ فَإِذَا حَبْلٌ مَمْدُودٌ بَيْنَ السَّارِيَتَيْنِ فَقَالَ: «مَا هَذَا الْحَبْلُ». قَالُوا هَذَا حَبْلٌ لِزَيْنَبَ فَإِذَا فَتَرَتْ تَعَلَّقَتْ. فَقَالَ النَّبِيُّ ﷺ: «لاَ، حُلُّوهُ، لِيُصَلِّ أَحَدُكُمْ نَشَاطَهُ، فَإِذَا فَتَرَ فَلْيَقْعُدْ». [رواه البخاري: ١١٥٠]

**609.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ (məscidə) daxil olub, iki dirək arasında çəkilmiş bir ip gördü və: "Bu nə ipdir"– deyə soruşdu. (Oradakılar): "Bu, Zeynəbin ipidir, (namaz qılıb) yorulduqda, ondan tutur"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "Yox, açın onu! Biriniz özünü gümrah hiss etdikcə namazını qılsın, yorulduqda isə otursun." (əl-Buxari, 1150)

## 16-cı fəsil. Daim gecə namazlarını qılan kimsənin bunu tərk etməsi bəyənilmir

## ١٦– باب: مَا يُكْرَهُ مِنْ تَرْكِ قِيَامِ اللَّيْلِ لِمَنْ كَانَ يَقُومُهُ

٦١٠ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ الْعَاصِ ﵄ قَالَ: قَالَ لِي رَسُولُ اللَّهِ ﷺ: «يَا عَبْدَ اللَّهِ، لاَ تَكُنْ مِثْلَ فُلاَنٍ، كَانَ يَقُومُ اللَّيْلَ فَتَرَكَ قِيَامَ اللَّيْلِ». [رواه البخاري: ١١٥٢]

**610.** Abdullah ibn Amr ibn As ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ mənə belə demişdir: "Ey Abdullah, sən filankəs kimi olma! O, gecələr namaza durardı, sonra isə gecə namazını tərk etdi." (əl-Buxari, 1152)

## 17-ci fəsil. Gecə yuxudan oyanıb namaz qılan kimsənin fəziləti

## ١٧– باب: فَضْلُ مَنْ تَعَارَّ مِنَ اللَّيْلِ فَصَلَّى

٦١١ – عَنْ عُبَادَةَ بْنِ الصَّامِت ﵁، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ تَعَارَّ مِنَ اللَّيْلِ فَقَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ، لَهُ الْمُلْكُ، وَلَهُ الْحَمْدُ، وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ. الْحَمْدُ لِلَّهِ، وَسُبْحَانَ اللَّهِ، وَلاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَاللَّهُ أَكْبَرُ، وَلاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ. ثُمَّ قَالَ اللَّهُمَّ اغْفِرْ لِي. أَوْ دَعَا اسْتُجِيبَ، فَإِنْ تَوَضَّأَ وَصَلَّى قُبِلَتْ صَلاَتُهُ». [رواه البخاري: ١١٥٤]

**611.** Ubadə ibn Samit رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim gecə oyanarkən: “Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Mülk Onundur, həmd Onadır və O hər şeyə Qadirdir. Həmd Allahadır. Allah pak və müqəddəsdir. Allahdan başqa məbud yoxdur. Allah ən Böyükdür. Qüdrət və güc yalnız Allahdadir![1]”– deyə (zikr etdikdən) sonra: “Ey Rəbbim, məni bağışla!”– desə və ya dua etsə, ona cavab verilər, qalxıb dəstəmaz aldıqdan sonra namaz qılsa, namazı qəbul olunar.” (əl-Buxari, 1154)

**٦١٢** – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه أَنَّهُ قَالَ وَهُوَ يَقْصُّ فِى قَصَصِهِ وَهُوَ يَذْكُرُ رَسُولَ اللَّهِ ﷺ: إِنَّ أَخًا لَكُمْ لاَ يَقُولُ الرَّفَثَ، يَعْنِى بِذَلِكَ عَبْدَ اللَّهِ بْنَ رَوَاحَةَ:

وَفِينَا رَسُولُ اللَّهِ يَتْلُو كِتَابَهُ      إِذَا انْشَقَّ مَعْرُوفٌ مِنَ الْفَجْرِ سَاطِعُ
أَرَانَا الْهُدَى بَعْدَ الْعَمَى فَقُلُوبُنَا      بِهِ مُوقِنَاتٌ أَنَّ مَا قَالَ وَاقِعُ
يَبِيتُ يُجَافِى جَنْبَهُ عَنْ فِرَاشِهِ      إِذَا اسْتَثْقَلَتْ بِالْمُشْرِكِينَ الْمَضَاجِعُ

[رواه البخاري: ١١٥٥]

**612.** Əbu Hureyra رضي الله عنه öz rəvayətlərindən birində (insanlara) xatırlatmışdır ki, Allahın elçisi ﷺ belə demişdir: “Həqiqətən, sizin qardaşınız pis söz danışmır.” Bununla o, Abdullah ibn Rəvahanı رضي الله عنه (və onun söylədiyi bu şeiri) qəsd etmişdir:

*Sübh çağı yetişəndə, dan yeri ağaranda,*
*Allahın Peyğəmbəri Quran oxuyur aramızda.*
*Gözlərimiz kor ikən, o bizə yol göstərdi,*
*Sözünün gerçəyini qəlbimiz yəqin etdi.*
*Gecələr o, böyrünü yatağından qaldırır,*[2]
*Müşriklərsə həmin vaxt, dərin yuxuya dalır.*

(əl-Buxari, 1155)

**٦١٣** – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: رَأَيْتُ عَلَى عَهْدِ النَّبِىِّ ﷺ كَأَنَّ بِيَدِى قِطْعَةَ إِسْتَبْرَق، فَكَأَنِّى لاَ أُرِيدُ مَكَانًا مِنَ الْجَنَّةِ إِلاَّ طَارَتْ إِلَيْهِ، وَرَأَيْتُ كَأَنَّ اثْنَيْنِ أَتَيَانِى أَرَادَا أَنْ يَذْهَبَا بِى إِلَى النَّارِ فَتَلَقَّاهُمَا مَلَكٌ فَقَالَ لَمْ تُرَعْ خَلِّيَا عَنْهُ. فَقَصَّتْ حَفْصَةُ رضي الله عنها عَلَى النَّبِىِّ ﷺ إِحْدَى رُؤْيَايَ فَقَالَ النَّبِىُّ ﷺ: «نِعْمَ الرَّجُلُ عَبْدُ اللَّهِ، لَوْ كَانَ يُصَلِّى مِنَ اللَّيْلِ»، فَكَانَ عَبْدُ اللَّهِ رضي الله عنهما يُصَلِّى مِنَ اللَّيْلِ. [رواه البخاري: ١١٥٦]

**613.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: “Peyğəmbərin ﷺ zamanında mən yuxuda gördüm ki, sanki əlimdə bir parça ipək var və Cənnətdə hansı bir yeri istəyirəmsə, bu parça (mənimlə birlikdə) oraya uçur və gördüm ki, iki (mələk) gəlib məni Cəhənnəmə tərəf aparmaq istəyir, (bu vaxt) qarşımıza bir mələk çıxıb (mənə): “Qorxma!”– (dedi, onlara da): “Buraxın onu!”– deyə əmr etdi. Sonra Həfsə mənim bu yuxumu Peyğəmbərə ﷺ danışdı. O dedi: “Nə gözəl insandır Abdullah! Kaş ki, gecələr namaz qılaydı.”

(Ravi deyir ki, bundan sonra) Abdullah رضي الله عنهما gecələr namaz qılardı. (əl-Buxari, 1156)

[1] Transkripsiyası: Lə ilahə illəllahu vəhdahu lə şərikə ləhu, ləhul-mulku və ləhul-həmdu və huvə alə kulli şeyin qadir, əlhəmdulilləhi, və subhanallahi, və lə ilahə illallahu, vəllahu əkbər, və lə həulə və lə quvvətə illə billəh.

[2] Burada müşriklər yuxuda ikən Peyğəmbərin ﷺ gecə namazı qıldığı nəzərdə tutulur.

## 18-ci fəsil. Könüllü qılınan namazların iki rükət-iki rükət qılınması haqqında

## ١٨ – باب:
## مَا جَاءَ فِى التَّطَوُّعِ مَثْنَى مَثْنَى

٦١٤ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵄ قَالَ كَانَ رَسُولُ اللَّهِ ﷺ يُعَلِّمُنَا الاسْتِخَارَةَ فِى الأُمُورِ كَمَا يُعَلِّمُنَا السُّورَةَ مِنَ الْقُرْآنِ يَقُولُ: «إِذَا هَمَّ أَحَدُكُمْ بِالأَمْرِ فَلْيَرْكَعْ رَكْعَتَيْنِ مِنْ غَيْرِ الْفَرِيضَةِ ثُمَّ لِيَقُلِ اللَّهُمَّ إِنِّى أَسْتَخِيرُكَ بِعِلْمِكَ وَأَسْتَقْدِرُكَ بِقُدْرَتِكَ، وَأَسْأَلُكَ مِنْ فَضْلِكَ الْعَظِيمِ، فَإِنَّكَ تَقْدِرُ وَلاَ أَقْدِرُ وَتَعْلَمُ وَلاَ أَعْلَمُ وَأَنْتَ عَلاَّمُ الْغُيُوبِ، اللَّهُمَّ إِنْ كُنْتَ تَعْلَمُ أَنَّ هَذَا الأَمْرَ خَيْرٌ لِى فِى دِينِى وَمَعَاشِى وَعَاقِبَةِ أَمْرِى – أَوْ قَالَ عَاجِلِ أَمْرِى وَآجِلِهِ – فَاقْدُرْهُ لِى وَيَسِّرْهُ لِى ثُمَّ بَارِكْ لِى فِيهِ، وَإِنْ كُنْتَ تَعْلَمُ أَنَّ هَذَا الأَمْرَ شَرٌّ لِى فِى دِينِى وَمَعَاشِى وَعَاقِبَةِ أَمْرِى – أَوْ قَالَ فِى عَاجِلِ أَمْرِى وَآجِلِهِ – فَاصْرِفْهُ عَنِّى وَاصْرِفْنِى عَنْهُ ، وَاقْدُرْ لِى الْخَيْرَ حَيْثُ كَانَ ثُمَّ أَرْضِنِى – قَالَ – وَيُسَمِّى حَاجَتَهُ». [رواه البخاري: ١١٦٢]

**614.** Cabir ibn Abdullah ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ Qurandakı surələri bizə öyrətdiyi kimi istixarə[1] duasını da bizə öyrədib deyərdi: «Sizdən biriniz bir işi görməyə qərar verdikdə fərz namazlarından əlavə iki rükət namaz qılsın və desin: "Allahım, Səndən Öz elminlə mənə kömək etməyi və Öz qüdrətinlə mənə qüdrət verməyi diləyirəm. Səndən, Sənin böyük lütfünü diləyirəm. Şübhəsiz ki, Sənin (hər şeyə) qüdrətin çatır, mənimsə qüdrətim çatmır, Sən (hər şeyi) bilirsən, mən isə bilmirəm. Qeybləri bilən Sənsən. Allahım, bu işin (işin adını çəkir) mənim dinim, yaşayışım və aqibətim üçün – yaxud deyir: dünyam və axirətim üçün, – xeyirli olduğunu (məsləhət) bilirsənsə, onu mənə nəsib et, asanlaşdır, sonra da onu mənim üçün bərəkətli et. Bu işin mənim dinim, yaşayışım və aqibətim üçün – yaxud deyir: dünyam və axirətim üçün – zərərli olduğunu (məsləhət) bilirsənsə, onu məndən, məni də ondan uzaq et! Harada olursa-olsun, mənə xeyir nəsib et, sonra məni ondan razı sal!"[2] (əl-Buxari, 1162)

## 19-cu fəsil. Sübh namazından qabaq qılınan iki rükət namazın davamiyyətli qılınması və bu iki rükətin könüllü olması haqqında

## ١٩ – باب:
## تَعَاهُدُ رَكْعَتَىِ الْفَجْرِ وَمَنْ سَمَّاهُمَا تَطَوُّعًا

٦١٥ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ لَمْ يَكُنِ النَّبِىُّ ﷺ عَلَى شَىْءٍ مِنَ النَّوَافِلِ أَشَدَّ مِنْهُ تَعَاهُدًا عَلَى رَكْعَتَىِ الْفَجْرِ. [رواه البخاري: ١١٦٩]

**615.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ nafilə namazlarından heç birini sübh namazının sünnəti[3] kimi davamlı qılmamışdır." (əl-Buxari, 1169)

---

[1] Görüləcək bir işin uğurlu olub-olmayacağını əvvəlcədən bilmək üçün Allahdan buna dair bir əlamət göstərməsini diləmək.

[2] Transkripsiyası: Allahummə inni əstəxirukə bi ilmikə, və əstəqdirukə bi qudratikə, və əs'əlukə min fadlikəl-azım, fəinnəkə təqdiru və lə əqdir, və tə'ləmu və lə a'ləm, və əntə alləmul-ğuyub. Allahummə in kuntə tə'ləmu ənnə həzəl-əmra xayrun li fi dini və məaşi və aqibəti əmri, acilihi və əcilihi – fəqdurhu li və yəssirhu li, summə bərik li fihi. Və in kuntə tə'ləmu ənnə həzəl-əmra şərrun li fi dini və məaşi və aqibəti əmri, acilihi və əcilihi – fasrifhu anni, vəsrifni anhu, vəqdur liyəl-xayra heysu kənə, summə ərdını.

[3] Söhbət sübh namazından qabaq qılınan iki rükət sünnət namazından gedir.

## 20-ci fəsil. Sübh namazından əvvəl qılınan iki rükətdə oxunan surə

## ٢٠– باب: مَا يُقْرَأُ فِى رَكْعَتَىِ الْفَجْرِ

٦١٦ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ كَانَ النَّبِىُّ ﷺ يُخَفِّفُ الرَّكْعَتَيْنِ اللَّتَيْنِ قَبْلَ صَلاَةِ الصُّبْحِ حَتَّى إِنِّى لأَقُولُ هَلْ قَرَأَ بِأُمِّ الْكِتَابِ. [رواه البخاري: ١١٧١]

**616.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ sübh namazından əvvəl qıldığı iki rükət (nafilə namazını) o qədər qısa qılardı ki, mən (öz-özümə): “Görəsən o əl-Fatihə surəsini oxudumu?”– deyərdim.” (əl-Buxari, 1171)

## 21-ci fəsil. Yaşadığı yerdə duha namazını qılmaq

## ٢١– باب: صَلاَةُ الضُّحَى فِى الْحَضَرِ

٦١٧ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ قَالَ أَوْصَانِى خَلِيلِى بِثَلاَثٍ لاَ أَدَعُهُنَّ حَتَّى أَمُوتَ صَوْمِ ثَلاَثَةِ أَيَّامٍ مِنْ كُلِّ شَهْرٍ ، وَصَلاَةِ الضُّحَى، وَنَوْمٍ عَلَى وِتْرٍ. [رواه البخاري: ١١٧٨]

**617.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Ən əziz dostum[1] mənə üç şeyi nəsihət etmişdir ki, mən ölənədək onları buraxan deyiləm, hər ay üç gün oruc tutmaq, duha namazını qılmaq və vitri qılıb yatmaq.” (əl-Buxari, 1178)

## 22-ci fəsil. Zöhr namazından əvvəl iki rükət (namaz) qılmaq

## ٢٢– باب: الرَّكْعَتَيْنِ قَبْلَ الظُّهْرِ

٦١٨ – عَنْ عَائِشَةَ ﵂ أَنَّ النَّبِىَّ ﷺ كَانَ لاَ يَدَعُ أَرْبَعًا قَبْلَ الظُّهْرِ وَرَكْعَتَيْنِ قَبْلَ الْغَدَاةِ. [رواه البخاري: ١١٨٢]

**618.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ zöhrdən əvvəl qıldığı dörd rükət və sübhdən əvvəl qıldığı iki rükət (nafilə) namazlarını heç vaxt buraxmazdı. (əl-Buxari, 1182)

## 23-cü fəsil. Məğrib namazından əvvəl namaz qılmaq

## ٢٣– باب: الصَّلاَةُ قَبْلَ الْمَغْرِبِ

٦١٩ – عَنْ عَبْدِ اللَّهِ الْمُزَنِىِّ ﵁، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «صَلُّوا قَبْلَ صَلاَةِ الْمَغْرِبِ»، قَالَ فِى الثَّالِثَةِ: لِمَنْ شَاءَ كَرَاهِيَةَ أَنْ يَتَّخِذَهَا النَّاسُ سُنَّةً. [رواه البخاري: ١١٨٣]

**619.** Abdullah əl-Muzəni ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ (üç dəfə): “Məğribdən qabaq namaz qılın!”– deyə təkrar etdi və üçüncü dəfə: “Bunu istəyənlər üçün”– dedi ki, insanlar bunu sünnə kimi qəbul etməsinlər. (əl-Buxari, 1183)

---

[1] Burada Peyğəmbəri ﷺ nəzərdə tutur.

# ٢٠ – كِتَابُ الصَّلاَةِ فِى مَسْجِدِ مَكَّةَ وَالْمَدِينَةِ

# 20 – Məkkə və Mədinə məscidlərində namaz qılmaq kitabı

## ١ – باب: فَضْلُ الصَّلاَةِ فِى مَسْجِدِ مَكَّةَ وَالْمَدِينَةِ

## 1-ci fəsil. Məkkə və Mədinə məscidlərində namaz qılmağın üstünlüyü

٦٢٠ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لاَ تُشَدُّ الرِّحَالُ إِلاَّ إِلَى ثَلاَثَةِ مَسَاجِدَ الْمَسْجِدِ الْحَرَامِ، وَمَسْجِدِ الرَّسُولِ ﷺ وَمَسْجِدِ الأَقْصَى». [رواه البخاري: ١١٨٩]

**620.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç məsciddən başqa heç bir yerə (ibadət məqsədi ilə) səfər etmək olmaz: (bu) – Məscidülhəram[1], Peyğəmbərin ﷺ məscidi və Məscidüləqsadır.[2]" (əl-Buxari, 1189)

٦٢١ – عَنْهُ ﷺ، أَنَّ النَّبِىَّ ﷺ قَالَ: «صَلاَةٌ فِى مَسْجِدِى هَذَا خَيْرٌ مِنْ أَلْفِ صَلاَةٍ فِيمَا سِوَاهُ إِلاَّ الْمَسْجِدَ الْحَرَامَ». [رواه البخاري: ١١٩٠]

**621.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim bu məscidimdə qılınan (bir) namaz Məscidülhəram istisna olmaqla, digər məscidlərdə qılınan min namazdan daha yaxşıdır"[3]. (əl-Buxari, 1190)

## ٢ – باب: مَسْجِدُ قُبَاءٍ

## 2-ci fəsil. Quba məscidi

٦٢٢ – عَنْ ابْنِ عُمَرَ ﷺ كَانَ لاَ يُصَلِّى مِنَ الضُّحَى إِلاَّ فِى يَوْمَيْنِ يَوْمَ يَقْدَمُ بِمَكَّةَ، فَإِنَّهُ كَانَ يَقْدَمُهَا ضُحًى، فَيَطُوفُ بِالْبَيْتِ، ثُمَّ يُصَلِّى رَكْعَتَيْنِ خَلْفَ الْمَقَامِ، وَيَوْمَ يَأْتِى مَسْجِدَ قُبَاءٍ، فَإِنَّهُ كَانَ يَأْتِيهِ كُلَّ سَبْتٍ، فَإِذَا دَخَلَ الْمَسْجِدَ كَرِهَ أَنْ يَخْرُجَ مِنْهُ حَتَّى يُصَلِّىَ فِيهِ. قَالَ وَكَانَ يُحَدِّثُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَزُورُهُ رَاكِبًا وَمَاشِيًا. وَكَانَ يَقُولُ إِنَّمَا أَصْنَعُ كَمَا رَأَيْتُ أَصْحَابِى يَصْنَعُونَ، وَلاَ أَمْنَعُ أَحَدًا أَنْ يُصَلِّىَ فِى أَىِّ سَاعَةٍ شَاءَ مِنْ لَيْلٍ أَوْ نَهَارٍ، غَيْرَ أَنْ لاَ تَتَحَرَّوْا طُلُوعَ الشَّمْسِ وَلاَ غُرُوبَهَا. [رواه البخاري: ١١٩١-١١٩٢]

**622.** Rəvayət edilir ki, ibn Ömər ﷺ iki gündən başqa heç vaxt səhər-səhər namaz qılmazdı. (Birincisi:) Məkkəyə gəldiyi gün, ibn Ömər səhər tezdən şəhərə daxil olar və (gəlib) Kəbəni təvaf etdikdən sonra İbrahim məqamının arxasında iki rükət namaz qılardı. (İkincisi:) Quba məscidinə gəldiyi gün, o, hər şənbə günü (Quba) məscidinə gedər və iki rükət namaz qılmamış oradan çıxmazdı. O, Pey-

---

[1] Məkkədə yerləşən və zəvvarların ziyarət etməsinə icazə verilən ilk müqəddəs ziyarətgahdır. Bu məsciddə namaz qılarkən qazanılan savab, başqa məscidlərdə yüz min dəfə namaz qılanın savabına bərabərdir. Allahın müqəddəs Evi – Kəbə məhz bu məsciddə yerləşir.

[2] Yerusəlimdə yerləşən və zəvvarların ziyarət etməsinə icazə verilən müqəddəs ziyarətgahdır. Bu məsciddə namaz qılarkən qazanılan savab, Məkkədəki müqəddəs məscid və Mədinədəki Muhəmməd Peyğəmbərin ﷺ məscidi istisna olmaqla, başqa məscidlərdə beş yüz dəfə namaz qılanın savabına bərabərdir.

[3] Söhbət namazın özündən deyil, savabından gedir.

ğəmbərin ﷺ (şənbə günləri) istər minik üstündə, istərsə də piyada bu məscidə getdiyini rəvayət edərdi və deyərdi ki: “Mən ancaq dostlarımın etdiyini edirəm və heç kəsə günəşin çıxdığı və batdığı vaxt istisna olmaqla, gecə və ya gündüz vaxtı istədiyi saatda namaz qılmağı qadağan etmirəm.” (əl-Buxari, 1191-1192)

## 3-cü fəsil.
## (Peyğəmbərin ﷺ) qəbri ilə minbəri arasında olan yerin fəziləti

## ٣– باب:
## فَضْلُ مَا بَيْنَ الْقَبْرِ وَالْمِنْبَرِ

٦٢٣ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِىِّ ﷺ قَالَ: «مَا بَيْنَ بَيْتِى وَمِنْبَرِى رَوْضَةٌ مِنْ رِيَاضِ الْجَنَّةِ، وَمِنْبَرِى عَلَى حَوْضِى». [رواه البخاري: ١١٩٦]

**623.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cənnət bağlarından biri mənim evimlə minbərim arasında yerləşir, minbərim isə hovuzumun başında durur.” (əl-Buxari, 1196)

# ٢١ – كِتَابُ العَمَلِ فِى الصَّلاةِ

# 21 – Namazdakı əməllər kitabı

## ١ – باب: مَا يُنْهَى عَنْهُ مِنَ الْكَلاَمِ فِى الصَّلاَةِ

## 1-ci fəsil. Namazda kəlmə kəsməyin qadağan olunması

٦٢٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ كُنَّا نُسَلِّمُ عَلَى النَّبِىِّ ﷺ وَهُوَ فِى الصَّلاَةِ فَيَرُدُّ عَلَيْنَا، فَلَمَّا رَجَعْنَا مِنْ عِنْدِ النَّجَاشِىِّ سَلَّمْنَا عَلَيْهِ فَلَمْ يَرُدَّ عَلَيْنَا وَقَالَ: «إِنَّ فِى الصَّلاَةِ شُغْلاً». [رواه البخاري: ١١٩٩]

**624.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Peyğəmbər ﷺ namaz qılarkən biz ona salam verərdik, o da bizim salamımızı alardı. Nəcaşinin yanından (Həbəşistandan) qayıtdıqdan sonra biz ona salam verdik, lakin o, bizim salamımızı almadı. (Namazı bitirdikdən sonra isə) buyurdu: "Həqiqətən, namaz əsnasında (daha vacib) əməl vardır." (əl-Buxari, 1199)

٦٢٥ – عَنْ زَيْدِ بْنِ أَرْقَمَ ﷺ قَالَ: إِنْ كُنَّا لَنَتَكَلَّمُ فِى الصَّلاَةِ عَلَى عَهْدِ النَّبِىِّ ﷺ، يُكَلِّمُ أَحَدُنَا صَاحِبَهُ بِحَاجَتِهِ حَتَّى نَزَلَتْ: ﴿حَٰفِظُواْ عَلَى ٱلصَّلَوَٰتِ﴾ الآيَةَ، فَأُمِرْنَا بِالسُّكُوتِ. [رواه البخاري: ١٢٠٠]

**625.** Rəvayət edilir ki, Zeyd ibn Ərqam ﷺ demişdir: "Peyğəmbərin ﷺ zamanında biz namaz əsnasında danışardıq, birimiz dostuna öz işlərindən danışardı. Nəhayət: **"Namazları və *günortadan sonrakı* orta namazı qoruyun və Allah qarşısında mütiliklə durun"**[1] ayəsi nazil oldu və bizə susmaq əmr olundu." (əl-Buxari, 1200)

## ٢ – باب: مَسْحُ الْحَصَى فِى الصَّلاَةِ

## 2-ci fəsil. Namaz əsnasında (səcdə yerindəki) xırda daşları təmizləmək

٦٢٦ – عَنْ مُعَيْقِيبٍ ﷺ، أَنَّ النَّبِىَّ ﷺ قَالَ فِى الرَّجُلِ يُسَوِّى التُّرَابَ حَيْثُ يَسْجُدُ قَالَ: «إِنْ كُنْتَ فَاعِلاً فَوَاحِدَةً». [رواه البخاري: ١٢٠٧]

**626.** Mueyqib ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ bir nəfərin səcdə etdikdə torpağı (əli ilə sağa-sola dağıdıb) yeri hamarladığını görüb dedi: "Bunu etmək istəyirsənsə, bir dəfə et." (əl-Buxari, 1107)

## ٣ – باب: إِذَا انْفَلَتَتِ الدَّابَّةُ فِى الصَّلاَةِ

## 3-cü fəsil. Namaz əsnasında minik heyvanı açılıb qaçsa (nə etmək lazımdır?)

٦٢٧ – عَنْ شُعْبَةَ قَالَ: حَدَّثَنَا الأَزْرَقُ بْنُ قَيْسٍ قَالَ كُنَّا بِالأَهْوَازِ نُقَاتِلُ الْحَرُورِيَّةَ، فَبَيْنَا أَنَا عَلَى جُرُفِ نَهَرٍ إِذَا رَجُلٌ يُصَلِّى، وَإِذَا لِجَامُ دَابَّتِهِ بِيَدِهِ فَجَعَلَتِ الدَّابَّةُ تُنَازِعُهُ، وَجَعَلَ يَتْبَعُهَا – قَالَ شُعْبَةُ – هُوَ أَبُو بَرْزَةَ الأَسْلَمِىُّ ﷺ –

[1] "əl-Bəqərə" surəsi , 238.

فَجَعَلَ رَجُلٌ مِنَ الْخَوَارِجِ يَقُولُ اللَّهُمَّ افْعَلْ بِهَذَا الشَّيْخِ. فَلَمَّا انْصَرَفَ الشَّيْخُ قَالَ إِنِّى سَمِعْتُ قَوْلَكُمْ، وَإِنِّى غَزَوْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ سِتَّ غَزَوَاتٍ أَوْ سَبْعَ غَزَوَاتٍ وَثَمَانِيًا، وَشَهِدْتُ تَيْسِيرَهُ، وَإِنِّى أَنْ كُنْتُ أَنْ أُرَاجِعَ مَعَ دَابَّتِى أَحَبُّ إِلَىَّ مِنْ أَنْ أَدَعَهَا تَرْجِعُ إِلَى مَأْلَفِهَا فَيَشُقَّ عَلَىَّ. [رواه البخاري: ١٢١١]

**627.** Şobədən rəvayət edilir ki, Əzraq ibn Qeys onlara belə rəvayət etmişdir: "Biz Əhvazda[1] Həruriləriə[2] döyüşərkən mən çayın qırağında idim. Orada mən bir nəfərin namaz qıldığını və (namaz əsnasında) atının yüyənini əlində saxladığını gördüm. Birdən at onu çəkib aparmağa başladı."

Şobə demişdir: "Bu, Əbu Bərzə əl-Əsləmi idi."

(Əzraq ibn Qeys dedi:) "Bu vaxt xəvariclərdən[3] biri: "Allahım, bu qocanın cəzasını ver!"– dedi. Qoca namazı bitirdikdən sonra dedi: "Mən sizin dediklərinizi eşitdim. (Biləsiniz ki,) mən Peyğəmbərlə ﷺ birlikdə altı, yeddi, ya da səkkiz döyüşdə iştirak etmişəm. Mən onun (belə hallarda insanlarla həmişə) yumşaq davrandığını görmüşəm. Mənim üçün atımı tutub saxlamaq, onu otladığı yerə buraxıb nigaran qalmaqdan daha yaxşıdır." (əl-Buxari, 1211)

٦٢٨ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: خَسَفَتِ الشَّمْسُ، فَقَامَ النَّبِىُّ ﷺ فَقَرَأَ سُورَةً طَوِيلَةً، ثُمَّ رَكَعَ فَأَطَالَ، ثُمَّ رَفَعَ رَأْسَهُ، ثُمَّ اسْتَفْتَحَ بِسُورَةٍ أُخْرَى، ثُمَّ رَكَعَ حَتَّى قَضَاهَا وَسَجَدَ، ثُمَّ فَعَلَ ذَلِكَ فِى الثَّانِيَةِ، ثُمَّ قَالَ: «إِنَّهُمَا آيَتَانِ مِنْ آيَاتِ اللَّهِ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَصَلُّوا حَتَّى يُفْرَجَ عَنْكُمْ، لَقَدْ رَأَيْتُ فِى مَقَامِى هَذَا كُلَّ شَىْءٍ وُعِدْتُهُ، حَتَّى لَقَدْ رَأَيْتُنِى أُرِيدُ أَنْ آخُذَ قِطْفًا مِنَ الْجَنَّةِ حِينَ رَأَيْتُمُونِى جَعَلْتُ أَتَقَدَّمُ، وَلَقَدْ رَأَيْتُ جَهَنَّمَ يَحْطِمُ بَعْضُهَا بَعْضًا حِينَ رَأَيْتُمُونِى تَأَخَّرْتُ، وَرَأَيْتُ فِيهَا عَمْرَو بْنَ لُحَىٍّ وَهُوَ الَّذِى سَيَّبَ السَّوَائِبَ». [رواه البخاري: ١٢١٢]

**628.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Günəşin üzü tutulduğu zaman Peyğəmbər ﷺ qalxıb (namaz qıldı və) uzun bir surə oxudu. Sonra rükuya getdi və rükunu uzatdı, sonra rükudan qalxdı və başqa bir surə oxuduqdan sonra (yenə) rükuya getdi, rükunu tamamladıqdan sonra səcdəyə qapandı, ikinci rükəti də bu qaydada yerinə yetirdikdən sonra dedi: "Günəşin və ayın tutulması Allahın dəlillərindəndir. Bunu gördüyünüz zaman (onların üzü) açılanadək namaz qılın. Mən dayandığım bu yerdə mənə vəd edilən hər şeyi gördüm. Siz mənim qabağa addım atdığımı gördüyünüz zaman mən Cənnətdən bir salxım (üzüm) götürmək istəyirdim. Mənim dala çəkildiyimi gördüyünüz zaman isə mən Cəhənnəmin (içindəkilərinin) bir-birini yandırıb-yaxdığını gördüm. Mən Cəhənnəmdə Amr ibn Lüheyi gördüm. Bu, o kimsədir ki, saibəni[4] sərbəst buraxmışdır." (əl-Buxari, 1212)

---

[1] İraqın cənubunda şəhər.

[2] 216-cı hədisin qeydlərinə bax.

[3] Xəvaric ərəbcə xərəcə ( خَرَجَ ) felindən əmələ gəlmiş xarici sözünün cəmidir. Xərəcə xaric olmaq, xarici isə xaric olan deməkdir. Xarici deyildikdə, müsəlman camaatından ayrılıb özünə dəstə yaradan və ya yaranmış belə bir dəstəyə qoşulan, dəlil-sübutsuz olaraq böyük günah sahibini kafir sayan və şəriətə zidd olan digər əxlaqları özündə cəm edən fasiqlər nəzərdə tutulur. Bu firqə müsəlmanlar arasında meydana gəlmiş ilk firqədir. Onlar Allahın razı qaldığı, Cənnətlə müjdələnmiş, İslam üçün canından və malından keçmiş, ölənədək Peyğəmbərə ﷺ sadiq olmuş Osman رضي الله عنه və Əli رضي الله عنه kimi iki böyük əshabəni kafir sayıb şəhid etmişlər.

[4] Saibə - ardıcıl olaraq on dişi dəvə balalayan və buna görə ərəb bütpərəstləri tərəfindən sitayiş edilən dişi dəvə. Bütpərəstlər onu sərbəst buraxır, onu minmir, onunla yük daşımır, yununu qırxmır və südünü də ancaq qonağa verərdilər. Bu pis adəti isə ərəblər arasında ilk dəfə Amr ibn Lühey dəb salmışdır.

## 4-cü fəsil. Namaz əsnasında verilən salamı almaq olmaz

## ٤– باب: لاَ يَرُدُّ السَّلاَمَ فِى الصَّلاَةِ

٦٢٩ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: بَعَثَنِى رَسُولُ اللَّهِ ﷺ فِى حَاجَةٍ لَهُ فَانْطَلَقْتُ، ثُمَّ رَجَعْتُ وَقَدْ قَضَيْتُهَا، فَأَتَيْتُ النَّبِىَّ ﷺ فَسَلَّمْتُ عَلَيْهِ ، فَلَمْ يَرُدَّ عَلَىَّ، فَوَقَعَ فِى قَلْبِى مَا اللَّهُ أَعْلَمُ بِهِ فَقُلْتُ فِى نَفْسِى لَعَلَّ رَسُولَ اللَّهِ ﷺ وَجَدَ عَلَىَّ أَنِّى أَبْطَأْتُ عَلَيْهِ، ثُمَّ سَلَّمْتُ عَلَيْهِ فَلَمْ يَرُدَّ عَلَىَّ، فَوَقَعَ فِى قَلْبِى أَشَدُّ مِنَ الْمَرَّةِ الأُولَى، ثُمَّ سَلَّمْتُ عَلَيْهِ فَرَدَّ عَلَىَّ فَقَالَ: «إِنَّمَا مَنَعَنِى أَنْ أَرُدَّ عَلَيْكَ أَنِّى كُنْتُ أُصَلِّى». وَكَانَ عَلَى رَاحِلَتِهِ مُتَوَجِّهًا إِلَى غَيْرِ الْقِبْلَةِ. [رواه البخاري: ١٢١٧]

**629.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ məni bir iş dalınca göndərdi və mən dərhal gedib o işi gördüm, sonra yenə onun yanına qayıtdım. Mən Peyğəmbərə ﷺ yaxınlaşıb salam verdim, lakin o, mənim salamımı almadı. Bir Allah bilir ki, mənim qəlbimdən nələr keçdi. Öz-özümə dedim: “Ola bilsin ki, ləngidiyimə görə Allahın Elçisinin mənə qəzəbi tutmuşdur?” Mən (bir də) ona salam verdim, lakin o, yenə mənim salamımı almadı. Bu məni əvvəlkindən də çox kədərləndirdi. Mən (yenə) ona salam verdim. Bu dəfə o, mənim salamımı aldı və dedi: “Mənə sənin salamını almağa maneə olan yalnız namaz qılmağım idi.” Həmin vaxt Peyğəmbər ﷺ dəvəsinin üstündə idi və qiblədən başqa bir tərəfə yönəlmişdi. (əl-Buxari, 1217)

## 5-ci fəsil. Namaz qılarkən əlləri belə qoymaq

## ٥– باب: الْخَصْرُ فِى الصَّلاَةِ

٦٣٠ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ يُصَلِّيَ الرَّجُلُ مُخْتَصِرًا. [رواه البخاري: ١٢٢٠]

**630.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: “Peyğəmbər ﷺ (namaz qılan) adama əllərini belinə qoyub namaz qılmağı qadağan etmişdir.” (əl-Buxari, 135)

# ٢٢ – كِتَابُ سُجُودِ السَهْوِ

# 22 – Səhv səcdəsi kitabı

## ١ – باب: إِذَا صَلَّى خَمْسًا

## 1-ci fəsil. (Dörd rükət əvəzinə) beş rükət namaz qılan adam (nə etməlidir?)

٦٣١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ صَلَّى الظُّهْرَ خَمْسًا، فَقِيلَ لَهُ أَزِيدَ فِي الصَّلاَةِ فَقَالَ: «وَمَا ذَاكَ». قَالَ صَلَّيْتَ خَمْسًا. فَسَجَدَ سَجْدَتَيْنِ بَعْدَ مَا سَلَّمَ. [رواه البخاري: ١٢٢٦]

**631.** Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ zöhr namazını beş rükət qıldı. Ondan: "Namaza əlavəmi olundu?"– deyə soruşdular. Peyğəmbər ﷺ: "Nə olub?"– deyə soruşdu. (Ona): "Sən beş rükət qıldın"– dedilər. Onda o, salamlardan sonra iki dəfə səcdə etdi. (əl-Buxari, 1226)

## ٢ – باب: إِذَا كُلِّمَ وَهُوَ يُصَلِّى فَأَشَارَ بِيَدِهِ وَاسْتَمَعَ

## 2-ci fəsil. (Namaz qılan) kimsəyə namazda ikən müraciət olunmuşdursa, o, əli ilə işarə etməli və dinləməlidir

٦٣٢ – عَنْ كُرَيْبٍ أَنَّ ابْنَ عَبَّاسٍ وَالْمِسْوَرَ بْنَ مَخْرَمَةَ وَعَبْدَ الرَّحْمَنِ بْنَ أَزْهَرَ ﷺ أَرْسَلُوهُ إِلَى عَائِشَةَ ﷺ فَقَالُوا اقْرَأْ عَلَيْهَا السَّلاَمَ مِنَّا جَمِيعًا وَسَلْهَا عَنِ الرَّكْعَتَيْنِ بَعْدَ صَلاَةِ الْعَصْرِ وَقُلْ لَهَا إِنَّا أُخْبِرْنَا أَنَّكِ تُصَلِّينَهُمَا وَقَدْ بَلَغَنَا أَنَّ النَّبِيَّ ﷺ نَهَى عَنْهَا. وَقَالَ ابْنُ عَبَّاسٍ وَكُنْتُ أَضْرِبُ النَّاسَ مَعَ عُمَرَ بْنِ الْخَطَّابِ. فَقَالَ كُرَيْبٌ فَدَخَلْتُ عَلَى عَائِشَةَ ﷺ فَبَلَّغْتُهَا مَا أَرْسَلُونِى. فَقَالَتْ سَلْ أُمَّ سَلَمَةَ. فَخَرَجْتُ إِلَيْهِمْ فَأَخْبَرْتُهُمْ بِقَوْلِهَا فَرَدُّونِى إِلَى أُمِّ سَلَمَةَ ﷺ بِمِثْلِ مَا أَرْسَلُونِى بِهِ إِلَى عَائِشَةَ ﷺ. فَقَالَتْ أُمُّ سَلَمَةَ ﷺ سَمِعْتُ النَّبِيَّ ﷺ يَنْهَى عَنْهَا ثُمَّ رَأَيْتُهُ يُصَلِّيهِمَا حِينَ صَلَّى الْعَصْرَ، ثُمَّ دَخَلَ عَلَيَّ وَعِنْدِى نِسْوَةٌ مِنْ بَنِى حَرَامٍ مِنَ الأَنْصَارِ فَأَرْسَلْتُ إِلَيْهِ الْجَارِيَةَ فَقُلْتُ: قُومِى بِجَنْبِهِ قُولِى لَهُ تَقُولُ لَكَ أُمُّ سَلَمَةَ يَا رَسُولَ اللَّهِ سَمِعْتُكَ تَنْهَى عَنْ هَاتَيْنِ وَأَرَاكَ تُصَلِّيهِمَا؟ فَإِنْ أَشَارَ بِيَدِهِ فَاسْتَأْخِرِى عَنْهُ. فَفَعَلَتِ الْجَارِيَةُ فَأَشَارَ بِيَدِهِ فَاسْتَأْخَرَتْ عَنْهُ فَلَمَّا انْصَرَفَ قَالَ: «يَا بِنْتَ أَبِى أُمَيَّةَ، سَأَلْتِ عَنِ الرَّكْعَتَيْنِ بَعْدَ الْعَصْرِ وَإِنَّهُ أَتَانِى نَاسٌ مِنْ عَبْدِ الْقَيْسِ فَشَغَلُونِى عَنِ الرَّكْعَتَيْنِ اللَّتَيْنِ بَعْدَ الظُّهْرِ فَهُمَا هَاتَانِ». [رواه البخاري: ١٢٣٣]

**632.** Kureyb ﷺ rəvayət edir ki, ibn Abbas Misvər ibn Məxrəmə və Abdur-Rəhman ibn Əzhər ﷺ onu Aişənin yanına göndərib tapşırdılar ki: "Hamımızın adından ona salam söylə və ondan əsrdən sonra qılınan iki rükət namaz haqqında soruş. Ona de: "Bizə xəbər gəlib çatmışdır ki, sən o iki rükəti qılırsan. Lakin bizə o da məlumdur ki, Peyğəmbər ﷺ bu namazı qılmağı qadağan etmişdir."

İbn Abbas ﷺ demişdir: "Mən Ömər ibn Xəttabla birlikdə bu namazı qılan adamları cəzalandırardıq."

Kureyb ﷺ dedi: "Mən Aişənin yanına gəlib onların dediklərini çatdırdım." Aişə dedi: "Sən Ummu Sələmədən soruş!" Mən qayıdıb Aişənin dediyini onlara xəbər verdim. Onlar da məni Ummu Sələmənin yanına göndərdilər və tapşırdılar ki, Aişədən soruşduğumu ondan soruşum.

Ummu Sələmə dedi: "Mən Peyğəmbərin ﷺ (əsrdən sonra) iki rükət namaz qılmağı qadağan etdiyini eşitdim, sonra da onun əsr namazından sonra bu iki rükəti qıldığını gördüm. O mənim yanıma gəldiyi vaxt ənsardan olan Bəni Haram qəbiləsinin qadınları mənim yanımda idilər. Mən kənizlərdən birini onun yanına göndərib tapşırdım ki, gedib onun yanında dursun və ona desin: "Ummu Sələmə sənə deyir: "Ey Allahın elçisi, mən sənin bu iki rükəti qadağan etdiyini eşitmişdim, indi isə sənin bu iki rükəti qıldığını görürəm." (Sonra Ummu Sələmə kənizə dedi:) "Əgər o əli ilə sənə işarə etsə, kənara çəkil və gözlə." Kəniz gedib (Ummu Sələmənin dediyini Peyğəmbərə ﷺ) deyəndə o, əli ilə işarə etdi və kəniz kənara çəkilib gözlədi. Peyğəmbər ﷺ namazı bitirdikdən sonra dedi: "Ey Əbu Ümeyyənin[1] qızı, məndən əsrdən sonra qıldığım iki rükət barəsində soruşdun. Bu ona görədir ki, Abdul-Qeys qəbiləsindən bir dəstə adam yanıma gəlib məni zöhrdən sonra qılacağım iki rükət namazdan yayındırdı. Bu həmin (sünnət) namazıdır." (əl-Buxari, 1233)

[1] Əbu Ümeyyə Ummu Sələmənin ﷺ atasıdır.

# ٢٣ – كِتَابُ الجَنَائِزِ

# 23 – Cənazələr kitabı

## 1-ci fəsil. Axır kəlməsi "Lə ilahə illəlah" olan kimsə haqqında

## ١ – باب: مَنْ كَانَ آخِرُ كَلاَمِهِ لاَ إِلَهَ إِلاَّ اللَّهُ

٦٣٣ – عَنْ أَبِى ذَرٍّ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَتَانِى آتٍ مِنْ رَبِّى فَأَخْبَرَنِى – أَوْ قَالَ بَشَّرَنِى – أَنَّهُ مَنْ مَاتَ مِنْ أُمَّتِى لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ الْجَنَّةَ » . قُلْتُ وَإِنْ زَنَى وَإِنْ سَرَقَ قَالَ: «وَإِنْ زَنَى وَإِنْ سَرَقَ». [رواه البخاري: ١٢٣٧]

**633.** Əbu Zərr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir nəfər[1] yanıma gəlib mənə xəbər verdi (və ya məni müjdələdi) ki, ümmətimdən Allaha şərik qoşmayıb ölən hər kəs Cənnətə daxil olacaq." Mən soruşdum: "Zina və oğurluq etmiş olsa belə?" Dedi: "Zina və oğurluq etmiş olsa belə." (əl-Buxari, 1237)

٦٣٤ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ مَاتَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ النَّارَ». وَقُلْتُ أَنَا: مَنْ مَاتَ لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ الْجَنَّةَ. [رواه البخاري: ١٢٣٨]

**634.** Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Allaha şərik qoşub ölərsə, Cəhənnəmə girər." Mən dedim: "Kim Allaha şərik qoşmayıb ölərsə, Cənnətə daxil olar." (əl-Buxari, 1238)

## 2-ci fəsil. Cənazənin ardınca getməyin əmr olunması

## ٢ – باب: الأَمْرُ بِاتِّبَاعِ الْجَنَائِزِ

٦٣٥ – عَنْ الْبَرَاءِ ﷺ قَالَ أَمَرَنَا النَّبِىُّ ﷺ بِسَبْعٍ، وَنَهَانَا عَنْ سَبْعٍ أَمَرَنَا بِاتِّبَاعِ الْجَنَائِزِ، وَعِيَادَةِ الْمَرِيضِ، وَإِجَابَةِ الدَّاعِى، وَنَصْرِ الْمَظْلُومِ، وَإِبْرَارِ الْقَسَمِ، وَرَدِّ السَّلاَمِ، وَتَشْمِيتِ الْعَاطِسِ. وَنَهَانَا عَنْ آنِيَةِ الْفِضَّةِ، وَخَاتَمِ الذَّهَبِ، وَالْحَرِيرِ، وَالدِّيبَاجِ، وَالْقَسِّىِّ، وَالإِسْتَبْرَقِ. [رواه البخاري: ١٢٣٩]

**635.** Rəvayət edilir ki, Bəra ibn Azib ﷺ demişdir: "Peyğəmbər ﷺ bizə yeddi şeyi əmr etdi və yeddi şeyi qadağan etdi. O, bizə cənazənin ardınca getməyi, xəstəni ziyarət etməyi, (məclisə) dəvət edənin dəvətini qəbul etməyi, məzluma yardım etməyi, andı yerinə yetirməyi, verilən salamı almağı və asqıran adama rəhmət diləməyi[2] əmr etdi. Və bizə gümüş qabdan (istifadə etməyi), qızıl üzük, ipək, zərxara, ipək qatışığı olan libas və atlas parça (geyməyi) qadağan etdi"[3]. (əl-Buxari, 1239)

---

[1] Burada Cəbrail ﷺ nəzərdə tutulur.

[2] Asqırdıqdan sonra "Əlhəmdulillah" deyən müsəlmana "Yərhəmukəllah" demək vacibdir.

[3] Hədisdə olan qadağalardan yalnız altısı sadalanmışdır. Lakin imam Buxarinin "libas" kitabında rəvayət etdiyi hədisdə deyilir ki, Peyğəmbər ﷺ ipəkdən olan yəhəri də onlara qadağan etmişdir. Qeyd etmək lazımdır ki, hədisdə qadağan olunmuş yeddi şey bu ümmətin kişilərinə aiddir. Qızıl və gümüş qablardan istifadə etmək isə həm kişilərə, həm də qadınlara aiddir.

## 3-cü fəsil. Meyit kəfənə büküldükdən sonra ona baş çəkmək

## ٣– باب: الدُّخُولُ عَلَى الْمَيِّتِ بَعْدَ الْمَوْتِ إِذَا أُدْرِجَ فِى كَفَنِهِ

٦٣٦ – عَنْ أُمِّ الْعَلاَءِ رضي الله عنها – امْرَأَة مِنَ الأَنْصَارِ – بَايَعَت النَّبِىَّ ﷺ أَنَّهُ اقْتُسِمَ الْمُهَاجِرُونَ قُرْعَةً فَطَارَ لَنَا عُثْمَانُ بْنُ مَظْعُونٍ، فَأَنْزَلْنَاهُ فِى أَبْيَاتِنَا، فَوَجِعَ وَجَعَهُ الَّذِى تُوُفِّىَ فِيهِ، فَلَمَّا تُوُفِّىَ وَغُسِّلَ وَكُفِّنَ فِى أَثْوَابِهِ، دَخَلَ رَسُولُ اللَّهِ ﷺ فَقُلْتُ رَحْمَةُ اللَّهِ عَلَيْكَ أَبَا السَّائِبِ، فَشَهَادَتِى عَلَيْكَ لَقَدْ أَكْرَمَكَ اللَّهُ. فَقَالَ النَّبِىُّ ﷺ: «وَمَا يُدْرِيكِ أَنَّ اللَّهَ قَدْ أَكْرَمَهُ». فَقُلْتُ بِأَبِى أَنْتَ يَا رَسُولَ اللَّهِ فَمَنْ يُكْرِمُهُ اللَّهُ فَقَالَ: «أَمَّا هُوَ فَقَدْ جَاءَهُ الْيَقِينُ، وَاللَّهِ إِنِّى لأَرْجُو لَهُ الْخَيْرَ، وَاللَّهِ مَا أَدْرِى – وَأَنَا رَسُولُ اللَّهِ – مَا يُفْعَلُ بِى». قَالَتْ فَوَاللَّهِ لاَ أُزَكِّى أَحَدًا بَعْدَهُ أَبَدًا. [رواه البخاري: ١٢٤٣]

**636.** Rəvayət edilir ki, ənsar qadınlardan Peyğəmbərə ﷺ beyət etmiş Ummu Əla رضي الله عنها demişdir: “Mühacirlər püşk atma yolu ilə (ənsarın yanına) yerləşdirildikdə Osman ibn Məzun bizə düşdü və biz onu öz evimizdə sakin etdik. (Bir müddətdən) sonra o xəstələndi və elə həmin xəstəlikdən də vəfat etdi. O, öləndən sonra onu yuyub öz libasına bürüdülər. (Bu vaxt) Peyğəmbər ﷺ (bizə) gəldi və mən dedim: “Allah sənə rəhmət eləsin, ey Əbu Saib![1] Mən şahidlik edirəm ki, Allah səni hörmətli etmişdir.” Peyğəmbər ﷺ dedi: “Sən nə bilirsən ki, Allah onu hörmətli etmişdir?” Dedim: “Atam sənə qurban, ya Rəsulullah, Allah (ona hörmət göstərməyib) kimə hörmət göstərəcək?” Peyğəmbər ﷺ buyurdu: “Ona artıq ölüm gəlmişdir. Vallahi, mən ona xeyir arzulayıram. Mən Allahın elçisi olduğum halda, vallahi ki, başıma nələr gələcəyini bilmirəm.”

Ummu Əla dedi: “Vallahi, o vaxtdan bəri mən heç kəsi (bu cür tərifləyib) təmizə çıxarmıram.” (əl-Buxari, 1143)

٦٣٧ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ لَمَّا قُتِلَ أَبِى جَعَلْتُ أَكْشِفُ الثَّوْبَ عَنْ وَجْهِهِ أَبْكِى، وَيَنْهَوْنِى عَنْهُ وَالنَّبِىُّ ﷺ لاَ يَنْهَانِى، فَجَعَلَتْ عَمَّتِى فَاطِمَةُ تَبْكِى، فَقَالَ النَّبِىُّ ﷺ: «تَبْكِينَ أَوْ لاَ تَبْكِينَ، مَا زَالَتِ الْمَلاَئِكَةُ تُظِلُّهُ بِأَجْنِحَتِهَا حَتَّى رَفَعْتُمُوهُ». [رواه البخاري: ١٢٤٤]

**637.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: “Atam şəhid olduqda[2] mən onun üzündəki örtüyü götürüb ağlamağa başladım. Əshabələr mənə (örtüyü onun üzündən götürməyə) qoymurdular. Peyğəmbər ﷺ isə bunu mənə qadağan etmədi. Bibim Fatimə də ağlamağa başladı. Peyğəmbər ﷺ (ona) dedi: “Ağlasan da, ağlamasan da (bu heç nəyi dəyişən deyil). Siz onu (döyüş meydanından) götürüb aparanadək mələklər öz qanadları ilə onun üstünə kölgə salmışdılar.” (əl-Buxari, 1244)

## 4-cü fəsil. Ölənin ailəsinə ölüm xəbərini çatdıran adam haqqında

## ٤– باب: الرَّجُلُ يَنْعَى إِلَى أَهْلِ الْمَيِّتِ بِنَفْسِهِ

٦٣٨ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَعَى النَّجَاشِىَّ فِى الْيَوْمِ الَّذِى مَاتَ فِيهِ، خَرَجَ إِلَى الْمُصَلَّى، فَصَفَّ بِهِمْ وَكَبَّرَ أَرْبَعًا. [رواه البخاري: ١٢٤٥]

---

[1] Əbu Saib Osman ibn Məzunun رضي الله عنه kunyəsidir. 92-ci hədisin qeydlərinə bax.

[2] Cabirin atası رضي الله عنهما Uhud döyüşündə şəhid olmuşdur.

**638.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Nəcaşinin[1] vəfat etdiyi gün Peyğəmbər ﷺ onun ölüm xəbərini (əshabələrinə) bildirdi. (Sonra) namazgaha gəlib camaatı cərgəbəcərgə düzdü və dörd dəfə təkbir gətirdi.[2]" (əl-Buxari, 1245)

٦٣٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «أَخَذَ الرَّايَةَ زَيْدٌ فَأُصِيبَ، ثُمَّ أَخَذَهَا جَعْفَرٌ فَأُصِيبَ، ثُمَّ أَخَذَهَا عَبْدُ اللَّهِ بْنُ رَوَاحَةَ فَأُصِيبَ – وَإِنَّ عَيْنَيْ رَسُولِ اللَّهِ ﷺ لَتَذْرِفَانِ – ثُمَّ أَخَذَهَا خَالِدُ بْنُ الْوَلِيدِ مِنْ غَيْرِ إِمْرَةٍ فَفُتِحَ لَهُ». [رواه البخاري: ١٢٤٦]

**639.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ dedi: "Zeyd bayrağı götürdü, şəhid oldu, sonra Cəfər ibn Əbu Talib onu götürdü, o da şəhid oldu, sonra Abdullah ibn Rəvaha onu götürdü, o da şəhid oldu.[3]" Bunu deyəndə Peyğəmbərin ﷺ gözləri yaşla doldu (və o davam edib dedi): "Sonra Xalid ibn Vəlid (heç kəsdən) əmr almadan onu götürdü və ona zəfər nəsib oldu." (əl-Buxari, 1246)

## 5-ci fəsil. Övladının ölümünə səbir edib mükafatını Allahdan diləyən kimsənin fəziləti

## ٥ – باب: فَضْلُ مَنْ مَاتَ لَهُ وَلَدٌ فَاحْتَسَبَ

٦٤٠ – عَنْهُ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «مَا مِنَ النَّاسِ مِنْ مُسْلِمٍ يُتَوَفَّى لَهُ ثَلاَثٌ لَمْ يَبْلُغُوا الْحِنْثَ، إِلاَّ أَدْخَلَهُ اللَّهُ الْجَنَّةَ بِفَضْلِ رَحْمَتِهِ إِيَّاهُمْ». [رواه البخاري: ١٢٤٨]

**640.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həddi-büluğa çatmamış üç uşağı ölən elə müsəlman yoxdur ki, Allah onu uşaqlara olan mərhəmətinin lütfü sayəsində Cənnətə daxil etməsin." (əl-Buxari, 1248)

## 6-cı fəsil. Yaxşı olar ki, (meyit) tək sayda yuyulsun

## ٦ – باب: مَا يُسْتَحَبُّ أَنْ يُغْسَلَ وِتْرًا

٦٤١ – عَنْ أُمِّ عَطِيَّةَ الأَنْصَارِيَّةِ ﷺ قَالَتْ: دَخَلَ عَلَيْنَا رَسُولُ اللَّهِ ﷺ حِينَ تُوُفِّيَتِ ابْنَتُهُ فَقَالَ: «اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا أَوْ أَكْثَرَ مِنْ ذَلِكَ إِنْ رَأَيْتُنَّ ذَلِكَ بِمَاءٍ وَسِدْرٍ، وَاجْعَلْنَ فِي الآخِرَةِ كَافُورًا أَوْ شَيْئًا مِنْ كَافُورٍ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي». فَلَمَّا فَرَغْنَا آذَنَّاهُ فَأَعْطَانَا حِقْوَهُ فَقَالَ: «أَشْعِرْنَهَا إِيَّاهُ». تَعْنِي إِزَارَهُ. [رواه البخاري: ١٢٥٣]

**641.** Rəvayət edilir ki, Ummu Ətiyyə əl-Ənsariyyə ﷺ demişdir: "Peyğəmbərin ﷺ qızı (Zeynəb) vəfat etdikdə, o bizim yanımıza gəlib dedi: "Onu üç və ya beş dəfə yaxud məsləhət bilirsinizsə, bundan da çox su və sidr[4] ilə yuyun. Axırıncısına kafur[5] da qatın. İşinizi bitirdikdən sonra mənə xəbər verin." Biz (onu yuyub) qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını[6] bizə verib dedi: "Onu buna sarıyın!" (əl-Buxari, 1253)

---

[1] Nəcaşi – Həbəşistan kralının titulu. Adı isə Əshəmədir.

[2] Hicrətin 8-ci ilində Peyğəmbər ﷺ qiyabi olaraq onun cənazə namazını qılmışdır. Çünki Həbəşistanda onun cənazə namazı qılınmamışdır.

[3] Bu əshabələr müsəlmanların rumlulara qarşı apardıqları Mutə döyüşündə şəhid olmuşlar.

[4] Şam fəsiləsindən həmişəyaşıl, iynəyarpaqlı ağacdır.

[5] Dəfnəkimilər fəsiləsindən həmişəyaşıl ağacdır.

[6] 239-cu hədisin qeydlərinə bax.

## ٧– باب: يُبْدَأُ بِمَيَامِنِ الْمَيِّتِ

## 7-ci fəsil. Meyiti (yuyanda) sağ əzalarından başlamaq lazımdır

٦٤٢ – عَنْ أُمِّ عَطِيَّةَ ﵂ قَالَتْ: قَالَ رَسُولُ اللَّهِ ﷺ فِى غَسْلِ ابْنَتِهِ: «ابْدَأْنَ بِمَيَامِنِهَا وَمَوَاضِعِ الْوُضُوءِ مِنْهَا». قَالَتْ وَمَشَطْنَاهَا ثَلاَثَةَ قُرُونٍ. [رواه البخاري: ١٢٥٤]

**642.** Ummu Ətiyyə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ qızını yuyan (qadınlara) demişdir: "Onun sağ tərəfindən və dəstəmazda yuyulan əzalarından başlayın."
(Ummu Ətiyyə) demişdir: "Biz onun saçlarını darayıb üç hörük hördük." (əl-Buxari, 1254)

## ٨– باب: الثِّيَابُ الْبِيضُ لِلْكَفَنِ

## 8-ci fəsil. Kəfən üçün ağ parça (seçmək)

٦٤٣ – عَنْ عَائِشَةَ ﵂ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كُفِّنَ فِى ثَلاَثَةِ أَثْوَابٍ يَمَانِيَةٍ بِيضٍ سَحُولِيَّةٍ مِنْ كُرْسُفٍ، لَيْسَ فِيهِنَّ قَمِيصٌ وَلاَ عِمَامَةٌ. [رواه البخاري: ١٢٤٦]

**643.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbəri ﷺ Yəmənin Səhuliyyə şəhərində hazırlanmış üç ədəd ağappaq pambıq parçaya bürüdülər. Bunların arasında nə köynək, nə də əmmamə var idi." (əl-Buxari, 1246)

## ٩– باب: الْكَفَنُ فِى ثَوْبَيْنِ

## 9-cu fəsil. Kəfənin iki parçadan ibarət olması

٦٤٤ – عَنِ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ بَيْنَمَا رَجُلٌ وَاقِفٌ بِعَرَفَةَ إِذْ وَقَعَ عَنْ رَاحِلَتِهِ فَوَقَصَتْهُ – أَوْ قَالَ فَأَوْقَصَتْهُ – قَالَ النَّبِىُّ ﷺ: «اغْسِلُوهُ بِمَاءٍ وَسِدْرٍ، وَكَفِّنُوهُ فِى ثَوْبَيْنِ، وَلاَ تُحَنِّطُوهُ وَلاَ تُخَمِّرُوا رَأْسَهُ، فَإِنَّهُ يُبْعَثُ يَوْمَ الْقِيَامَةِ مُلَبِّيًا». [رواه البخاري: ١٢٦٥]

**644.** Rəvayət edilir ki, ibn Abbas ﵄ demişdir: "Bir nəfər Ərəfatda ikən dəvəsinin üstündən yerə yıxıldı və boynu sındı. Peyğəmbər ﷺ buyurdu: "Onu su və sidr ilə yuyun və iki parçaya bürüyün; ona ətir vurmayın, başını da örtməyin, çünki Qiyamət günü o, təlbiyə[1] deyə-deyə həşr[2] olunacaq." (əl-Buxari, 1265)

## ١٠– باب: الْكَفَنُ لِلْمَيِّتِ

## 10-cu fəsil. Meyit üçün kəfən (seçmək)

٦٤٥ – عَنِ ابْنِ عُمَرَ ﵄، أَنَّ عَبْدَ اللَّهِ بْنَ أُبَىٍّ لَمَّا تُوُفِّىَ جَاءَ ابْنُهُ إِلَى النَّبِىِّ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ أَعْطِنِى قَمِيصَكَ أُكَفِّنْهُ فِيهِ، وَصَلِّ عَلَيْهِ وَاسْتَغْفِرْ لَهُ، فَأَعْطَاهُ النَّبِىُّ ﷺ قَمِيصَهُ فَقَالَ: «آذِنِّى أُصَلِّى عَلَيْهِ». فَآذَنَهُ، فَلَمَّا أَرَادَ أَنْ يُصَلِّىَ عَلَيْهِ جَذَبَهُ عُمَرُ ﵁ فَقَالَ أَلَيْسَ اللَّهُ نَهَاكَ أَنْ تُصَلِّىَ عَلَى الْمُنَافِقِينَ فَقَالَ: «أَنَا بَيْنَ خِيرَتَيْنِ قَالَ:

---
[1] 132-ci hədisin qeydlərinə bax.
[2] Yəni, Qiyamət günü dirildiləcək.

﴿ٱسْتَغْفِرْ لَهُمْ أَوْ لَا تَسْتَغْفِرْ لَهُمْ إِن تَسْتَغْفِرْ لَهُمْ سَبْعِينَ مَرَّةً فَلَن يَغْفِرَ ٱللَّهُ لَهُمْ﴾». فَصَلَّى عَلَيْهِ فَنَزَلَتْ ﴿وَلَا تُصَلِّ عَلَىٰٓ أَحَدٍ مِّنْهُم مَّاتَ أَبَدًا﴾ [رواه البخاري: ١٢٦٩]

**645.** İbn Ömər ﷺ rəvayət edir ki, Abdullah ibn Ubey vəfat etdikdən sonra onun oğlu Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, köynəyini ver, atamı ona bürüyək, onun namazını qıl və onun üçün (Allahdan) bağışlanma dilə". Peyğəmbər ﷺ köynəyini ona verdi və dedi: "(Onu dəfn etməyə apardıqda) mənə bildirərsən, cənazə namazını qılaram." (Bir müddətdən sonra Abdullahın oğlu gəlib) Peyğəmbərə ﷺ xəbər verdi. Peyğəmbər ﷺ ona namaz qılmaq istəyəndə Ömər onun ətəyindən dartıb dedi: "Məgər Allah münafiqlərin cənazə namazını qılmağı sənə qadağan etməyibmi?" Peyğəmbər ﷺ: "Mən (onların cənazə namazını qılıb-qılmamaqda) ixtiyar sahibiyəm!"– deyib bu ayəni oxudu: "Onlar üçün bağışlanma diləsən də, diləməsən də, hətta, onlar üçün yetmiş dəfə bağışlanma diləsən belə, Allah onları əsla bağışlamayacaq"[1], sonra da onun cənazə namazını qıldı. (Onda) bu ayə nazil oldu: "Heç vaxt onlardan ölmüş bir kəsin cənazə namazını qılma, qəbrinin başında da durma. Çünki onlar Allahı və Onun Elçisini inkar etdilər və günahkar olaraq öldülər."[2] (əl-Buxari, 1269)

٦٤٦ – عَنْ جَابِرٍ ﷺ قَالَ: أَتَى النَّبِيُّ ﷺ عَبْدَ اللَّهِ بْنَ أُبَيٍّ بَعْدَ مَا دُفِنَ فَأَخْرَجَهُ، فَنَفَثَ فِيهِ مِنْ رِيقِهِ وَأَلْبَسَهُ قَمِيصَهُ. [رواه البخاري: ١٢٧٠]

**646.** Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Abdullah ibn Ubey dəfn edildikdən sonra Peyğəmbər ﷺ gəlib onu qəbirdən çıxardı, onun üstünə yüngülcə tüpürdü və öz köynəyini ona geyindirdi." (əl-Buxari, 1270)

## 11-ci fəsil. Əgər kəfən meyitin ancaq (bədənini və) başını və ya (bədənini və) ayaqlarını örtməyə çatarsa, bununla onun başı örtülməlidir

## ١١ – باب: إِذَا لَمْ يَجِدْ كَفَنًا إِلاَّ مَا يُوَارِي رَأْسَهُ أَوْ قَدَمَيْهِ غَطَّى رَأْسَهُ

٦٤٧ – عَنْ خَبَّابٌ ﷺ قَالَ هَاجَرْنَا مَعَ النَّبِيِّ ﷺ نَلْتَمِسُ وَجْهَ اللَّهِ، فَوَقَعَ أَجْرُنَا عَلَى اللَّهِ، فَمِنَّا مَنْ مَاتَ لَمْ يَأْكُلْ مِنْ أَجْرِهِ شَيْئًا مِنْهُمْ مُصْعَبُ بْنُ عُمَيْرٍ ﷺ، وَمِنَّا مَنْ أَيْنَعَتْ لَهُ ثَمَرَتُهُ فَهُوَ يَهْدِبُهَا. قُتِلَ يَوْمَ أُحُدٍ، فَلَمْ نَجِدْ مَا نُكَفِّنُهُ إِلاَّ بُرْدَةً إِذَا غَطَّيْنَا بِهَا رَأْسَهُ خَرَجَتْ رِجْلاَهُ، وَإِذَا غَطَّيْنَا رِجْلَيْهِ خَرَجَ رَأْسُهُ، فَأَمَرَنَا النَّبِيُّ ﷺ أَنْ نُغَطِّيَ رَأْسَهُ، وَأَنْ نَجْعَلَ عَلَى رِجْلَيْهِ مِنَ الإِذْخِرِ. [رواه البخاري: ١٢٧٦]

**647.** Rəvayət edilir ki, Xəbbab ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Allahın Üzünü diləyərək (Məkkədən Mədinəyə) hicrət etdik və (buna görə də) Allah bizi mükafatlandırdı. Bizlərdən kimisi (bu dünyada) öz mükafatından dadmadan ölüb getdi, Musab ibn Umeyr o kimsələrdən idi. Kimisinin də mükafatı öz bəhrəsini vermiş və o, (indiyədək) onu yığmaqdadır. (Musab ibn Umeyr) Uhud

[1] "ət-Tovbə" surəsi, 80.
[2] "ət-Tovbə" surəsi, 84.

döyüşündə şəhid oldu. Biz onu kəfənləmək üçün (onun əynindəki) libasdan başqa bir şey tapa bilmədik. Bu libasla onun baş tərəfini örtürdük ayaqları açıq qalırdı, ayaqlarını örtürdük başı açıq qalırdı. Onda Peyğəmbər ﷺ bizə, (bu libasla) onun baş tərəfini örtməyi, ayaqlarının üstünə də ətirli qamış qoymağı əmr etdi." (əl-Buxari, 1276)

## ١٢– باب: مَنِ اسْتَعَدَّ الْكَفَنَ فِى زَمَنِ النَّبِىِّ ﷺ فَلَمْ يُنْكَرْ عَلَيْهِ

## 12-ci fəsil. Peyğəmbərin ﷺ zamanında hər kim əvvəlcədən özü üçün kəfən hazırlayardısa, heç kəs onu qınamazdı

٦٤٨ – عَنْ سَهْلٍ رضي الله عنه أَنَّ امْرَأَةً جَاءَتِ النَّبِىَّ ﷺ بِبُرْدَةٍ مَنْسُوجَةٍ فِيهَا حَاشِيَتُهَا – أَتَدْرُونَ مَا الْبُرْدَةُ قَالُوا الشَّمْلَةُ. قَالَ نَعَمْ. قَالَتْ نَسَجْتُهَا بِيَدِى، فَجِئْتُ لأَكْسُوَكَهَا. فَأَخَذَهَا النَّبِىُّ ﷺ مُحْتَاجًا إِلَيْهَا، فَخَرَجَ إِلَيْنَا وَإِنَّهَا إِزَارُهُ، فَحَسَّنَهَا فُلاَنٌ فَقَالَ اكْسُنِيهَا، مَا أَحْسَنَهَا. قَالَ الْقَوْمُ مَا أَحْسَنْتَ، لَبِسَهَا النَّبِىُّ ﷺ مُحْتَاجًا إِلَيْهَا، ثُمَّ سَأَلْتَهُ وَعَلِمْتَ أَنَّهُ لاَ يَرُدُّ. قَالَ إِنِّى وَاللَّهِ مَا سَأَلْتُهُ لأَلْبَسَهَا إِنَّمَا سَأَلْتُهُ لِتَكُونَ كَفَنِى. قَالَ سَهْلٌ فَكَانَتْ كَفَنَهُ. [رواه البخاري: ١٢٧٧]

**648.** Rəvayət edilir ki, Səhl رضي الله عنه demişdir: "(Bir dəfə) bir qadın Peyğəmbərə ﷺ haşiyələnmiş parçadan (tikilmiş) bir bürdə gətirdi."

(Səhl hədisə qulaq asan tabiinlərdən soruşdu:) "Heç bilirsiniz bürdə nədir?" Onlar: "Bürüncəkdir"- deyə cavab verdilər. Səhl: "Bəli"- dedi.

(Bürüncəyi gətirən qadın) dedi: "Mən onu öz əllərimlə toxumuşam və gətirmişəm ki, onu sənə geyindirim." Peyğəmbər ﷺ ehtiyac üzündən bürüncəyi götürdü, sonra da onu geyib bizim yanımıza gəldi. Filankəs onu tərifləyib dedi: "Nə gözəl bürüncəkdir, onu mənə bağışla!" Camaat dedi: "Yaxşı iş görmədin. Axı Peyğəmbər ﷺ onu ehtiyac üzündən geyinmişdi. Sən bilə-bilə ki, o (heç kəsi) rədd etmir, bunu ondan istədin." O dedi: "Vallahi ki, mən bunu ondan geyinmək üçün istəmədim. Mən bu bürüncəyi ondan ona görə istədim ki, o, mənim kəfənim olsun."

Səhl dedi: "(Axırda) o bürüncək onun kəfəni oldu." (əl-Buxari, 1277)

## ١٣– باب: اتِّبَاعُ النِّسَاءِ الْجَنَائِزِ

## 13-cü fəsil. Qadınlar cənazənin ardınca gedə bilərmi?

٦٤٩ – عَنْ أُمِّ عَطِيَّةَ رضي الله عنها قَالَتْ نُهِينَا عَنِ اتِّبَاعِ الْجَنَائِزِ، وَلَمْ يُعْزَمْ عَلَيْنَا. [رواه البخاري: ١٢٧٨]

**649.** Rəvayət edilir ki, Ummu Ətiyyə رضي الله عنها demişdir: "Cənazənin ardınca getmək bizə qadağan edilmişdir, lakin bu bizə ciddi və qəti surətdə qadağan olunmamışdı." (əl-Buxari, 1278)

## ١٤– باب: إِحْدَادُ الْمَرْأَةِ عَلَى غَيْرِ زَوْجِهَا

## 14-cü fəsil. Qadının öz ərindən başqa birisi üçün yas saxlaması

٦٥٠ – عَنْ أُمِّ حَبِيبَةَ رضي الله عنها زَوْجِ النَّبِيِّ ﷺ فَقَالَتْ سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «لاَ يَحِلُّ لاِمْرَأَةٍ تُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ تُحِدُّ عَلَى مَيِّتٍ فَوْقَ ثَلاَثٍ، إِلاَّ عَلَى زَوْجٍ أَرْبَعَةَ أَشْهُرٍ وَعَشْرًا». [رواه البخاري: ١٢٨١]

**650.** Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Ummu Həbibə رضي الله عنها demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Allaha və Axirət gününə iman gətirmiş qadına ölmüş bir kimsə üçün üç gündən artıq yas saxlamaq halal deyildir. Yalnız əri üçün dörd ay on gün (yas saxlaya bilər).” (əl-Buxari, 1281)

## ١٥– باب: زِيَارَةُ الْقُبُورِ

## 15-ci fəsil. Qəbirləri ziyarət etmək

٦٥١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ مَرَّ النَّبِيُّ ﷺ بِامْرَأَةٍ تَبْكِي عِنْدَ قَبْرٍ فَقَالَ: «اتَّقِي اللَّهَ وَاصْبِرِي». قَالَتْ إِلَيْكَ عَنِّي، فَإِنَّكَ لَمْ تُصَبْ بِمُصِيبَتِي، وَلَمْ تَعْرِفْهُ. فَقِيلَ لَهَا إِنَّهُ النَّبِيُّ ﷺ. فَأَتَتْ بَابَ النَّبِيِّ ﷺ فَلَمْ تَجِدْ عِنْدَهُ بَوَّابِينَ فَقَالَتْ لَمْ أَعْرِفْكَ، فَقَالَ: «إِنَّمَا الصَّبْرُ عِنْدَ الصَّدْمَةِ الأُولَى». [رواه البخاري: ١٢٨٣]

**651.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ bir qəbrin başında durub ağlayan qadının yanından keçərkən (ona) buyurdu ki: “Allahdan qorx və səbir et!” Qadın onun kim olduğunu bilməyib dedi: “Əl çək məndən! Mənim başıma gələn müsibət sənin başına gəlməyib.” Qadına: “Bu, Peyğəmbər ﷺ idi”– dedilər. Bundan sonra o, Peyğəmbərin ﷺ qapısının yanına gəldi, lakin orada gözətçilərə rast gəlmədi. Qadın (üzrxahlıq edib): “Mən səni tanımamışam”– dedi. Peyğəmbər ﷺ buyurdu: “İlk sarsıntı anında səbir etmək lazım idi!” (əl-Buxari, 1283)

## ١٦– باب: قَوْلُ النَّبِيِّ ﷺ: «يُعَذَّبُ الْمَيِّتُ بِبَعْضِ بُكَاءِ أَهْلِهِ عَلَيْهِ» إِذَا كَانَ النَّوْحُ مِنْ سُنَّتِهِ

## 16-cı fəsil. Peyğəmbərin ﷺ: “Ölənin ailəsi onun üçün vay-şivən qoparıb ağlayarsa, – əgər o özü də sağlığında belə etmişdirsə, onda ona əzab verilər” sözü

٦٥٢ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ رضي الله عنهما قَالَ: أَرْسَلَتِ ابْنَةُ النَّبِيِّ ﷺ إِلَيْهِ إِنَّ ابْنًا لِي قُبِضَ فَائْتِنَا. فَأَرْسَلَ يُقْرِئُ السَّلاَمَ وَيَقُولُ: «إِنَّ لِلَّهِ مَا أَخَذَ وَلَهُ مَا أَعْطَى وَكُلٌّ عِنْدَهُ بِأَجَلٍ مُسَمًّى، فَلْتَصْبِرْ وَلْتَحْتَسِبْ». فَأَرْسَلَتْ إِلَيْهِ تُقْسِمُ عَلَيْهِ لَيَأْتِيَنَّهَا، فَقَامَ وَمَعَهُ سَعْدُ بْنُ عُبَادَةَ رضي الله عنه وَمُعَاذُ بْنُ جَبَلٍ رضي الله عنه وَأُبَيُّ بْنُ كَعْبٍ رضي الله عنه وَزَيْدُ بْنُ ثَابِتٍ رضي الله عنه وَرِجَالٌ، فَرُفِعَ إِلَى رَسُولِ اللَّهِ ﷺ الصَّبِيُّ وَنَفْسُهُ تَتَقَعْقَعُ – قَالَ حَسِبْتُهُ أَنَّهُ قَالَ – كَأَنَّهَا شَنٌّ. فَفَاضَتْ عَيْنَاهُ. فَقَالَ سَعْدٌ رضي الله عنه: يَا رَسُولَ اللَّهِ مَا هَذَا؟ فَقَالَ: «هَذِهِ رَحْمَةٌ جَعَلَهَا اللَّهُ فِي قُلُوبِ عِبَادِهِ، وَإِنَّمَا يَرْحَمُ اللَّهُ مِنْ عِبَادِهِ الرُّحَمَاءَ».
[رواه البخاري: ١٢٨٤]

**652.** Rəvayət edilir ki, Usamə ibn Zeyd ﷺ demişdir: "Peyğəmbərin ﷺ qızı (Zeynəb): "Oğlum ölür, bizə gəl!"– deyə atasına xəbər göndərdi. Peyğəmbər ﷺ (xəbər gətirən adama buyurdu ki, Zeynəbin yanına qayıdıb) onu salamlasın və desin: "Şübhəsiz ki, Allahın aldığı da, verdiyi də Özünə aiddir. Onun yanında hər şeyin öz müəyyən əcəli var... Səbir et və (bunun əvəzinə Allah yanında mükafat qazanacağına) ümid bağla!" (Bir müddətdən sonra) Zeynəb, (atası) mütləq gəlsin deyə, and verib (xəbərçini yenə) onun yanına göndərdi. Peyğəmbər ﷺ qalxıb Səd ibn Ubadə, Muaz ibn Cəbəl, Ubey ibn Kəb, Zeyd ibn Sabit və başqa bir neçə əshabə ilə onun yanına gəldi. (Evə daxil olduqda) körpəni Peyğəmbərə ﷺ verdilər. Uşaq xırıldayaraq[1] nəfəs alırdı. (Bunu görəndə) Peyğəmbərin ﷺ gözləri yaşla doldu. Səd dedi: "Bu nədir, ya Rəsulullah? (Sən də ağlayırsan?)" Peyğəmbər ﷺ buyurdu: "Bu, Allahın Öz qullarının qəlbinə saldığı mərhəmətdir. Allah Öz qullarından yalnız rəhmli olanlara rəhm edir." (əl-Buxari, 1284)

**٦٥٣ –** عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ شَهِدْنَا بِنْتًا لِرَسُولِ اللَّهِ ﷺ قَالَ وَرَسُولُ اللَّهِ ﷺ جَالِسٌ عَلَى الْقَبْرِ – قَالَ فَرَأَيْتُ عَيْنَيْهِ تَدْمَعَانِ قَالَ – فَقَالَ: «هَلْ مِنْكُمْ رَجُلٌ لَمْ يُقَارِفِ اللَّيْلَةَ». فَقَالَ أَبُو طَلْحَةَ أَنَا، قَالَ: «فَانْزِلْ». قَالَ فَنَزَلَ فِى قَبْرِهَا. [رواه البخاري: ١٢٨٥]

**653.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Biz Peyğəmbərin ﷺ qızının[2] dəfnində iştirak etdik. (O vaxt) Peyğəmbər ﷺ qəbrin baş tərəfində oturmuşdu. Mən onun gözlərinin yaşla dolduğunu gördüm. O soruşdu: "Aranızda bu gecə qadını ilə yaxınlıq etməyən bir kimsə varmı?" Əbu Təlhə: "Mən"– deyə cavab verdi. Peyğəmbər ﷺ: (ona) "Elə isə sən düş!"– deyə buyurdu. O, qadının qəbrinə düşdü (və onu yerbəyer etdi)." (əl-Buxari, 1285)

**٦٥٤ –** عَنْ عُمَرَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: إِنَّ الْمَيِّتَ يُعَذَّبُ بِبَعْضِ بُكَاءِ أَهْلِهِ عَلَيْهِ. قَالَ ابْنُ عَبَّاسٍ ﷺ: فَلَمَّا مَاتَ عُمَرُ ﷺ ذَكَرْتُ ذَلِكَ لِعَائِشَةَ ﷺ فَقَالَتْ: رَحِمَ اللَّهُ عُمَرَ، وَاللَّهِ مَا حَدَّثَ رَسُولُ اللَّهِ ﷺ إِنَّ اللَّهَ لَيُعَذِّبُ الْمُؤْمِنَ بِبُكَاءِ أَهْلِهِ عَلَيْهِ. وَلَكِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِنَّ اللَّهَ لَيَزِيدُ الْكَافِرَ عَذَابًا بِبُكَاءِ أَهْلِهِ عَلَيْهِ». وَقَالَتْ حَسْبُكُمُ الْقُرْآنُ: ﴿وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَىٰ﴾. [رواه البخاري: ١٢٨٨]

**654.** Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ölən adam, bəzən ailəsinin ona ağlamağından dolayı əzab çəkir."

İbn Abbas ﷺ demişdir: "Ömər vəfat etdikdən sonra mən onun dediklərini Aişəyə söylədim. Aişə dedi: "Allah Ömərə rəhmət eləsin! Vallahi, Rəsulullah ﷺ deməmişdir ki, Allah möminə, ailəsinin ona ağlamağından dolayı əzab verir. Əksinə, Rəsulullah ﷺ demişdir ki: "Allah kafirə, ailəsinin ona ağlamağından dolayı əzabını artırır." Sonra (Aişə) belə buyurdu: Quranın **"Heç bir günahkar başqasının günah yükünü daşımaz"** ayəsi[3] sizə kifayət edər. (əl-Buxari, 1288)

**٦٥٥ –** عَنْ عَائِشَةَ ﷺ زَوْجِ النَّبِىِّ ﷺ قَالَتْ: إِنَّمَا مَرَّ رَسُولُ اللَّهِ ﷺ عَلَى يَهُودِيَّةٍ يَبْكِى عَلَيْهَا أَهْلُهَا فَقَالَ: «إِنَّهُمْ لَيَبْكُونَ عَلَيْهَا، وَإِنَّهَا لَتُعَذَّبُ فِى قَبْرِهَا». [رواه البخاري: ١٢٨٩]

---

[1] Hədisi danışan ravi demişdir: "Deyəsən, Üsamə ﷺ demişdir ki: "Körpə quru və boş su qabından çıxan səs kimi səs çıxarıb inildəyirdi."

[2] Peyğəmbərin ﷺ qızı Ümmü Gülsüm ﷺ hicrətin 9-cu ilində vəfat etmişdir.

[3] "əl-Fatir" surəsi, 18.

**655.** Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Aişə ﵂ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ bir yəhudi qadının (qəbrinin) yanından keçərkən ailəsinin onun üçün ağladığını (görüb) dedi: “Onlar onun üçün (vay-şivən qoparıb) ağlayırlar, halbuki qəbirdə ona əzab verilər.” (əl-Buxari, 1289)

## 17-ci fəsil. Ölən adam üçün nə cür ağlamaq bəyənilmir?

## ١٧– باب: مَا يُكْرَهُ مِنَ النِّيَاحَةِ عَلَى الْمَيِّتِ

**٦٥٦** – عَنْ عَنْ الْمُغِيرَةِ ﵁ قَالَ سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «إِنَّ كَذِبًا عَلَيَّ لَيْسَ كَكَذِبٍ عَلَى أَحَدٍ، مَنْ كَذَبَ عَلَيَّ مُتَعَمِّدًا فَلْيَتَبَوَّأْ مَقْعَدَهُ مِنَ النَّارِ». سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «مَنْ نِيحَ عَلَيْهِ يُعَذَّبُ بِمَا نِيحَ عَلَيْهِ». [رواه البخاري: ١٢٩١]

**656.** Rəvayət edilir ki, Muğira ﵁ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Mənim adımdan danışılan yalan başqa birisinin adından danışılan yalan kimi deyildir. Kim bilərəkdən mənim adımdan yalan danışarsa, Cəhənnəmdə öz yerini tutsun!”

(Muğira həmçinin) demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Kimin üçün vay-şivən salıb ağlasalar, buna görə ona əzab verilər.” (əl-Buxari, 1291)

## 18-ci fəsil. Paltarını cıran kimsə bizdən deyildir

## ١٨– باب: لَيْسَ مِنَّا مَنْ شَقَّ الْجُيُوبَ

**٦٥٧** – عَنْ عَبْدِ اللَّهِ ﵁ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «لَيْسَ مِنَّا مَنْ لَطَمَ الْخُدُودَ، وَشَقَّ الْجُيُوبَ، وَدَعَا بِدَعْوَى الْجَاهِلِيَّةِ». [رواه البخاري: ١٢٩٤]

**657.** Abdullah ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Üz-gözünə döyən, paltarının yaxasını cıran və cahiliyyət dövründə deyilən sözləri deyən kimsə bizdən deyildir.[1]” (əl-Buxari, 1294)

## 19-cu fəsil. Peyğəmbərin ﷺ Səd ibn Xovləyə ﵁ yazığı gəlməsi

## ١٩– باب: رِثَاءُ النَّبِيِّ ﷺ سَعْدَ ابْنَ خَوْلَةَ

**٦٥٨** – عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ﵁ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَعُودُنِي عَامَ حَجَّةِ الْوَدَاعِ مِنْ وَجَعٍ اشْتَدَّ بِي فَقُلْتُ إِنِّي قَدْ بَلَغَ بِي مِنَ الْوَجَعِ وَأَنَا ذُو مَالٍ، وَلاَ يَرِثُنِي إِلاَّ ابْنَةٌ، أَفَأَتَصَدَّقُ بِثُلُثَيْ مَالِي قَالَ: «لاَ». فَقُلْتُ بِالشَّطْرِ فَقَالَ: «لاَ» ثُمَّ قَالَ: «الثُّلُثُ وَالثُّلْثُ كَبِيرٌ أَوْ كَثِيرٌ إِنَّكَ أَنْ تَذَرَ وَرَثَتَكَ أَغْنِيَاءَ خَيْرٌ مِنْ أَنْ تَذَرَهُمْ عَالَةً يَتَكَفَّفُونَ النَّاسَ، وَإِنَّكَ لَنْ تُنْفِقَ نَفَقَةً تَبْتَغِي بِهَا وَجْهَ اللَّهِ إِلاَّ أُجِرْتَ بِهَا، حَتَّى مَا تَجْعَلُ فِي فِي امْرَأَتِكَ». فَقُلْتُ: يَا رَسُولَ اللَّهِ، أُخَلَّفُ بَعْدَ أَصْحَابِي؟ قَالَ: «إِنَّكَ لَنْ تُخَلَّفَ فَتَعْمَلَ عَمَلاً صَالِحًا إِلاَّ ازْدَدْتَ بِهِ دَرَجَةً وَرِفْعَةً، ثُمَّ لَعَلَّكَ أَنْ تُخَلَّفَ حَتَّى يَنْتَفِعَ بِكَ أَقْوَامٌ وَيُضَرَّ بِكَ آخَرُونَ، اللَّهُمَّ أَمْضِ لأَصْحَابِي هِجْرَتَهُمْ، وَلاَ تَرُدَّهُمْ عَلَى أَعْقَابِهِمْ، لَكِنِ الْبَائِسُ سَعْدُ ابْنُ خَوْلَةَ، يَرْثِي لَهُ رَسُولُ اللَّهِ ﷺ أَنْ مَاتَ بِمَكَّةَ». [رواه البخاري: ١٢٩٥]

[1] Ölüyə ağladıqda həddi aşan hər kəs Peyğəmbərin ﷺ sünnəsinə zidd hərəkət etmiş hesab olunur.

**658.** Rəvayət edilir ki, Səd ibn Əbu Vəqqas ﵁ demişdir: “Mən vida həcci ilində xəstələnmişdim deyə Peyğəmbər ﷺ (tez-tez) mənə baş çəkirdi. Onda mən (ona) dedim: “Mənim xəstəliyim çox ağırlaşıb! Mən var-dövlət sahibiyəm, qızımdan başqa da bir varisim yoxdur. Malımın üçdə ikisini sədəqə verə bilərəmmi?” O: “Xeyr!”– deyə buyurdu. Dedim: “Yarısını (verə bilərəmmi)?” O: “Xeyr”– deyə cavab verdi, sonra da belə buyurdu: “Üçdə birini, əslində üçdə biri də çoxdur. Şübhəsiz ki, sənin üçün varislərini zəngin qoyub getməyin, onları kasıb və dilənçi vəziyyətdə qoyub getməyindən daha xeyirlidir. Sən Allahın Üzünü diləyərək xərclədiyin sədəqənin, hətta həyat yoldaşının ağzına qoyduğun (loxmanın) belə əvəzini mütləq alacaqsan.” Dedim: “Ya Rəsulullah, mən (burada ölüb) qardaşlarımdan geridəmi qalacağam?” O dedi: “Sən əsla geridə qalmayacaqsan. Etdiyin (hər bir) yaxşı əməl sayəsində sənin dərəcən və hörmətin mütləq artacaq. Bundan başqa bəlkə də, sən elə bir uzun ömür yaşayacaqsan[1] ki, sənin sayəndə bəziləri xeyir əldə edəcək, digərlərinə isə zərər dəyəcəkdir.[2] Allahım, əshabələrimin hicrətini tamamla və onları geri döndərmə.[3] Yazıq Səd ibn Xovlə!”

(Səd ibn Əbu Vəqqas demişdir:) “Peyğəmbər ﷺ (bu sözü ilə) onun Məkkədə vəfat etməsinə[4] heyfsiləndi.” (əl-Buxari, 1295)

## 20-ci fəsil. Müsibət üz verdikdə baş qırxmağın qadağan olunması

## ٢٠– باب: مَا يُنْهَى مِنَ الْحَلْقِ عِنْدَ الْمُصِيبَةِ

٦٥٩ – عَنْ أَبِي مُوسَى ﵁، أَنَّهُ وَجِعَ وَجَعًا فَغُشِيَ عَلَيْه، وَرَأْسُهُ فِي حَجْرِ امْرَأَةٍ مِنْ أَهْلِه فَبَكَتْ، فَلَمْ يَسْتَطِعْ أَنْ يَرُدَّ عَلَيْهَا شَيْئًا، فَلَمَّا أَفَاقَ قَالَ: أَنَا بَرِيءٌ مِمَّنْ بَرِئَ مِنْهُ رَسُولُ اللَّهِ ﷺ، إِنَّ رَسُولَ اللَّهِ ﷺ بَرِئَ مِنَ الصَّالِقَةِ وَالْحَالِقَةِ وَالشَّاقَّةِ. [رواه البخاري: ١٢٩٦]

**659.** Rəvayət edilir ki, (bir dəfə) Əbu Musa ﵁ ağır xəstələndi və başı zövcələrindən birinin qucağında ikən bayıldı. Bu vaxt zövcəsi (fəryad qoparıb) ağlamağa başladı və Əbu Musa ona heç nə deyə bilmədi. Ayıldıqda isə dedi: “Peyğəmbərin ﷺ uzaq olduğu kimsədən mən də uzağam. Həqiqətən, Peyğəmbər ﷺ (müsibət üz verdikdə) şivən salıb ağlayan, başını qırxdıran və paltarını cıran kimsədən uzaqdır!” (əl-Buxari, 1296)

## 21-ci fəsil. Baş vermiş müsibətdən (xəbər tutduğu zaman) oturan və üzündə kədər hissi oyanan kimsə haqqında

## ٢١– باب: مَنْ جَلَسَ عِنْدَ الْمُصِيبَةِ يُعْرَفُ فِيهِ الْحُزْنُ

٦٦٠ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: لَمَّا جَاءَ النَّبِيَّ ﷺ قَتْلُ ابْنِ حَارِثَةَ وَجَعْفَرٍ وَابْنِ رَوَاحَةَ جَلَسَ يُعْرَفُ فِيهِ الْحُزْنُ، وَأَنَا أَنْظُرُ مِنْ صَائِرِ الْبَابِ – شَقِّ الْبَابِ – فَأَتَاهُ رَجُلٌ، فَقَالَ إِنَّ نِسَاءَ جَعْفَرٍ، وَذَكَرَ بُكَاءَهُنَّ، فَأَمَرَهُ أَنْ يَنْهَاهُنَّ،

---

[1] Bu hadisədən sonra Səd ibn Vəqqas ﵁ qırx ilə yaxın yaşamışdır.

[2] Burada xeyir və zərər deyildikdə bu səhabənin əli ilə möminlərə nəsib olan xeyir və kafirlərə dəyən zərər nəzərdə tutulur.

[3] Burada Peyğəmbər ﷺ Allaha dua edir ki, əshabələrini Məkkədə sakin etməyib sağ-salamat Mədinəyə qaytarsın.

[4] Səd ibn Xovlə ﵁ 632-ci ildə Məkkədə vəfat etmişdir.

فَذَهَبَ ثُمَّ أَتَاهُ الثَّانِيَةَ، لَمْ يُطِعْنَهُ فَقَالَ انْهَهُنَّ. فَأَتَاهُ الثَّالِثَةَ قَالَ وَاللَّهِ غَلَبْنَنَا يَا رَسُولَ اللَّهِ فَزَعَمَتْ أَنَّهُ قَالَ: «فَاحْثُ فِى أَفْوَاهِهِنَّ التُّرَابَ». [رواه البخاري: ١٢٩٩]

**660.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "İbn Harisənin, Cəfərin və ibn Rəvahanın şəhid olduğuna dair xəbər Peyğəmbərə ﷺ çatdıqda o, (yerə) oturdu, kədərli olması üzündən hiss olunurdu, mən qapının arasından ona baxırdım. (Bu vaxt) bir nəfər onun yanına gəlib: "Cəfərin qadınları..."– deyə onların (fəryad qoparıb) ağladıqlarını bildirdi. Peyğəmbər ﷺ ona əmr etdi ki, (bu cür ağlamağı) onlara qadağan etsin. Adam getdi, sonra ikinci dəfə (Peyğəmbərin ﷺ yanına) gəlib onların ona itaət etmədiklərini bildirdi. Peyğəmbər ﷺ: "Onlara qadağan et!"– deyə buyurdu. Adam üçüncü dəfə Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Vallahi, onlar bizi yendilər, ya Rəsulullah." Peyğəmbər ﷺ buyurdu: "(Get) onların ağzını torpaqla bağla!" (əl-Buxari, 1299)

## 22-ci fəsil. Müsibət üz verdikdə kədərli olduğunu bildirməyən kimsə haqqında

## ٢٢– باب: مَنْ لَمْ يُظْهِرْ حُزْنَهُ عِنْدَ الْمُصِيبَةِ

٦٦١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﵁ يَقُولُ اشْتَكَى ابْنٌ لأَبِى طَلْحَةَ ﵁ قَالَ فَمَاتَ وَأَبُو طَلْحَةَ خَارِجٌ، فَلَمَّا رَأَتِ امْرَأَتُهُ أَنَّهُ قَدْ مَاتَ هَيَّأَتْ شَيْئًا وَنَحَّتْهُ فِى جَانِبِ الْبَيْتِ، فَلَمَّا جَاءَ أَبُو طَلْحَةَ قَالَ كَيْفَ الْغُلاَمُ قَالَتْ قَدْ هَدَأَتْ نَفْسُهُ، وَأَرْجُو أَنْ يَكُونَ قَدِ اسْتَرَاحَ. وَظَنَّ أَبُو طَلْحَةَ أَنَّهَا صَادِقَةٌ، قَالَ فَبَاتَ، فَلَمَّا أَصْبَحَ اغْتَسَلَ، فَلَمَّا أَرَادَ أَنْ يَخْرُجَ، أَعْلَمَتْهُ أَنَّهُ قَدْ مَاتَ، فَصَلَّى مَعَ النَّبِىِّ ﷺ ثُمَّ أَخْبَرَ النَّبِىَّ ﷺ بِمَا كَانَ مِنْهُمَا، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «لَعَلَّ اللَّهَ أَنْ يُبَارِكَ لَكُمَا فِى لَيْلَتِكُمَا».

قَالَ رَجُلٌ مِنَ الأَنْصَارِ: فَرَأَيْتُ لَهُمَا تِسْعَةَ أَوْلاَدٍ كُلُّهُمْ قَدْ قَرَأَ الْقُرْآنَ. [رواه البخاري: ١٣٠١]

**661.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "Əbu Təlhənin ﵁ oğlu xəstələndi və Əbu Təlhə ﵁ evdə yox ikən vəfat etdi. Zövcəsi uşağın öldüyünü görəndə onu yuyub kəfənlədi və evin bir tərəfinə qoydu. Əbu Təlhə ﵁ evə gəldikdə soruşdu ki: "Uşaq necədir?" Qadın dedi: "Uşaq sakitləşib və mən inanıram ki, o, artıq rahatlaşıb." Əbu Təlhə ﵁ onun doğru danışdığını güman etdi və (zövcəsi ilə birlikdə) uzanıb yatdı. Səhər açıldıqda Əbu Təlhə qüsl etdi, evdən çıxarkən qadın ona uşağın öldüyünü bildirdi. Əbu Təlhə Peyğəmbərlə ﷺ birlikdə (sübh) namazını qıldıqdan sonra başlarına gələnləri ona danışdı. Peyğəmbər ﷺ dedi: "Ümid edirəm ki, Allah bu gecənizi sizin üçün mübarək etmişdir!"

Ənsardan biri demişdir: "Mən onların doqquz övladını gördüm. Hamısı Quran oxuyurdu[1]." (əl-Buxari, 1301)

## 23-cü fəsil. Peyğəmbərin ﷺ: "Həqiqətən, biz səndən (ayrıldığımıza görə) kədərlənirik" sözü

## ٢٣– باب: قَوْلُ النَّبِىِّ ﷺ: «إِنَّا بِكَ لَمَحْزُونُونَ»

٦٦٢ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﵁ قَالَ دَخَلْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ عَلَى أَبِى سَيْفٍ الْقَيْنِ – وَكَانَ ظِئْرًا لإِبْرَاهِيمَ ﵇ فَأَخَذَ رَسُولُ اللَّهِ ﷺ إِبْرَاهِيمَ فَقَبَّلَهُ وَشَمَّهُ، ثُمَّ دَخَلْنَا عَلَيْهِ بَعْدَ ذَلِكَ، وَإِبْرَاهِيمُ يَجُودُ بِنَفْسِهِ، فَجَعَلَتْ عَيْنَا رَسُولِ اللَّهِ

[1] Yəni onların hər biri Quranı əzbər bilirdi.

ﷺ تَذْرِفَانِ. فَقَالَ لَهُ عَبْدُ الرَّحْمَنِ بْنُ عَوْفٍ رضي الله عنه وَأَنْتَ يَا رَسُولَ اللَّهِ؟ فَقَالَ: «يَا ابْنَ عَوْفٍ إِنَّهَا رَحْمَةٌ». ثُمَّ أَتْبَعَهَا بِأُخْرَى فَقَالَ ﷺ: «إِنَّ الْعَيْنَ تَدْمَعُ، وَالْقَلْبَ يَحْزَنُ، وَلاَ نَقُولُ إِلاَّ مَا يَرْضَى رَبُّنَا، وَإِنَّا بِفِرَاقِكَ يَا إِبْرَاهِيمُ لَمَحْزُونُونَ». [رواه البخاري: ١٣٠٣]

**662.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə dəmirçi Əbu Seyfin yanına gəldik. Əbu Seyf İbrahimin عليه السلام süd anasının əri idi. Peyğəmbər ﷺ (oğlu) İbrahimi qucağına alıb öpdü və onu iylədi. Bir müddətdən sonra biz yenə onun yanına getdik. İbrahim artıq can verirdi. Peyğəmbərin ﷺ gözləri yaşla doldu. Abdur-Rəhman ibn Auf dedi: "Sən də (ağlayırsan), ya Rəsulullah?" O: "Ey ibn Auf, bu bir mərhəmətdir!"– deyə buyurdu, sonra ağlaya-ağlaya dedi: "Həqiqətən, gözlər ağlayır, qəlb kədərlənir və biz ancaq Rəbbimizin razı qalacağı sözləri danışırıq. Ey İbrahim! Həqiqətən də, biz sənin ayrılığına kədərlənirik." (əl-Buxari, 1303)

## ٢٤– باب: الْبُكَاءُ عِنْدَ الْمَرِيضِ

## 24-cü fəsil. Xəstənin yanında ağlamaq

٦٦٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ اشْتَكَى سَعْدُ بْنُ عُبَادَةَ رضي الله عنه شَكْوَى لَهُ فَأَتَاهُ النَّبِيُّ ﷺ يَعُودُهُ مَعَ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ وَسَعْدِ بْنِ أَبِي وَقَّاصٍ وَعَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ فَلَمَّا دَخَلَ عَلَيْهِ فَوَجَدَهُ فِي غَاشِيَةِ أَهْلِهِ فَقَالَ: «قَدْ قَضَى؟» قَالُوا لاَ يَا رَسُولَ اللَّهِ. فَبَكَى النَّبِيُّ ﷺ فَلَمَّا رَأَى الْقَوْمُ بُكَاءَ النَّبِيِّ ﷺ بَكَوْا فَقَالَ: «أَلاَ تَسْمَعُونَ إِنَّ اللَّهَ لاَ يُعَذِّبُ بِدَمْعِ الْعَيْنِ، وَلاَ بِحُزْنِ الْقَلْبِ، وَلَكِنْ يُعَذِّبُ بِهَذَا – وَأَشَارَ إِلَى لِسَانِهِ – أَوْ يَرْحَمُ وَإِنَّ الْمَيِّتَ يُعَذَّبُ بِبُكَاءِ أَهْلِهِ عَلَيْهِ». [رواه البخاري: ١٣٠٤]

**663.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Səd ibn Ubadə xəstələndiyi zaman Peyğəmbər ﷺ Abdur-Rəhman ibn Auf, Səd ibn Əbu Vəqqas və Abdullah ibn Məsud ilə birlikdə ona baş çəkdi. Xəstənin yanına daxil olduqda ailəsinin onun başına yığışdığını görüb soruşdu: "Öldümü?" Onlar: "Xeyr, ya Rəsulullah!" – deyə cavab verdilər. Peyğəmbər ﷺ (Sədi görəndə) ağladı. Oradakılar Peyğəmbərin ﷺ ağladığını gördükdə ağlamağa başladılar. Peyğəmbər ﷺ dedi: "Eşitmirsinizmi? Allah gözlərdən axan yaşa və qəlbin kədərlənməsinə görə (heç) kəsə əzab vermir. O ancaq buna görə ya əzab verir, ya da rəhm edir (deyə) dilinə işarə etdi. Həqiqətən, ölən adama ailəsinin onun üçün (fəryad edib) ağlamasından dolayı əzab verilir." (əl-Buxari, 1304)

## ٢٥– باب: مَا يُنْهَى عَنِ النَّوْحِ وَالْبُكَاءِ وَالزَّجْرِ عَنْ ذَلِكَ

## 25-ci fəsil. Vay-şivən salmağın və bərkdən ağlamağın qadağan olunması, (və insanları) bundan çəkindirmək haqqında

٦٦٤ – عَنْ أُمِّ عَطِيَّةَ رضي الله عنها قَالَتْ: أَخَذَ عَلَيْنَا النَّبِيُّ ﷺ عِنْدَ الْبَيْعَةِ أَنْ لاَ نَنُوحَ، فَمَا وَفَتْ مِنَّا امْرَأَةٌ غَيْرَ خَمْسِ نِسْوَةٍ أُمِّ سُلَيْمٍ وَأُمِّ الْعَلاَءِ وَابْنَةِ أَبِي سَبْرَةَ امْرَأَةِ مُعَاذٍ وَامْرَأَتَيْنِ أَوِ ابْنَةِ أَبِي سَبْرَةَ وَامْرَأَةِ مُعَاذٍ وَامْرَأَةٍ أُخْرَى. [رواه البخاري: ١٣٠٦]

**664.** Rəvayət edilir ki, Ummu Ətiyyə ﵂ demişdir: "Beyət[1] əsnasında Peyğəmbər ﷺ ölü üçün vay-şivən salıb ağlamayacağımıza dair bizdən əhd almışdı. Bizlərdən beş qadın – Ummu Suleym, Ummu Əla, Əbu Səbrənin qızı Muazın zövcəsi və başqa iki qadın, yaxud Əbu Səbrənin qızı, Muazın zövcəsi və başqa bir qadın istisna olmaqla heç kəs əhdinə vəfa etmədi." (əl-Buxari, 1306)

## 26-cı fəsil. Cənazə görəndə ayağa qalxmaq

## ٢٦– باب: الْقِيَامُ لِلْجَنَازَةِ

٦٦٥ – عَنْ عَامِرِ بْنِ رَبِيعَةَ ﵁ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا رَأَى أَحَدُكُمْ جَنَازَةً فَإِنْ لَمْ يَكُنْ مَاشِيًا مَعَهَا فَلْيَقُمْ حَتَّى يُخَلِّفَهَا، أَوْ تُخَلِّفَهُ أَوْ تُوضَعَ مِنْ قَبْلِ أَنْ تُخَلِّفَهُ». [رواه البخاري: ١٣٠٨]

**665.** Amir ibn Rəbiə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz cənazə gördüyü zaman cənazənin ardınca getməyəcəksə, qoy cənazə onu arxada buraxanadək (və ya yanından keçib gedənədək, yaxud yerə qoyulanadək) ayaq üstə dursun." (əl-Buxari, 1308)

## 27-ci fəsil. Cənazəni görüb ayağa qalxan adam nə vaxt otura bilər?

## ٢٧– باب: مَتَى يَقْعُدُ إِذَا قَامَ لِلْجَنَازَةِ

٦٦٦ – عَنْ سَعِيد الْمَقْبُرِيِّ ﵀ عَنْ أَبِيه قَالَ كُنَّا فِى جَنَازَة فَأَخَذَ أَبُو هُرَيْرَةَ ﵁ بِيَد مَرْوَانَ فَجَلَسَا قَبْلَ أَنْ تُوضَعَ، فَجَاءَ أَبُو سَعِيد ﵁ فَأَخَذَ بِيَد مَرْوَانَ فَقَالَ قُمْ فَوَاللَّهِ لَقَدْ عَلِمَ هَذَا أَنَّ النَّبِيَّ ﷺ نَهَانَا عَنْ ذَلِكَ. فَقَالَ أَبُو هُرَيْرَةَ ﵁ صَدَقَ. [رواه البخاري: ١٣٠٩]

**666.** Səid əl-Məqburi ﵀ rəvayət edir ki, atası demişdir: "(Bir dəfə) biz bir cənazənin dəfnində iştirak edirdik. Əbu Hureyra Mərvanın əlindən tutdu və cənazə yerə qoyulmamışdan əvvəl hər ikisi yerə oturdu. (Bu vaxt) Əbu Səid əl-Xudri gəlib Mərvanın əlindən tutub dedi: "Qalx ayağa! Vallahi, bu adam[2] bilir ki, Peyğəmbər ﷺ bunu bizə qadağan etmişdir." Əbu Hureyra dedi: "O doğru deyir." (əl-Buxari, 1309)

## 28-ci fəsil. Yəhudinin cənazəsini görüb ayağa qalxan kimsə haqqında

## ٢٨– باب: مَنْ قَامَ لِجَنَازَةِ يَهُودِيٍّ

٦٦٧ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّه ﵄ قَالَ: مَرَّ بِنَا جَنَازَةٌ فَقَامَ لَهَا النَّبِيُّ ﷺ وَقُمْنَا بِه. فَقُلْنَا يَا رَسُولَ اللَّهِ، إِنَّهَا جَنَازَةُ يَهُودِيٍّ. قَالَ: «إِذَا رَأَيْتُمُ الْجَنَازَةَ فَقُومُوا». [رواه البخاري: ١٣١١]

**667.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: "Yanımızdan cənazə aparırdılar. (Bu vaxt) Peyğəmbər ﷺ ayağa qalxdı və biz də onunla birlikdə ayağa

---

[1] Peyğəmbərin ﷺ dəvətini qəbul edərək ona müti və sadiq olmağa dair söz vermək.

[2] Əbu Səid ﵁ "bu adam" deyəndə Əbu Hureyranı ﵁ nəzərdə tutmuşdur.

qalxdıq. Biz dedik: "Ey Allahın elçisi! Axı bu, yəhudinin cənazəsidir." Peyğəmbər ﷺ buyurdu: "Cənazə gördüyünüz zaman ayağa qalxın!" (əl-Buxari, 1311)

## 29-cu fəsil. Cənazəni qadınlar deyil, ancaq kişilər aparmalıdırlar

## ٢٩- باب: حَمْلُ الرِّجَالِ الْجِنَازَةَ دُونَ النِّسَاءِ

٦٦٨ - عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا وُضِعَتِ الْجِنَازَةُ وَاحْتَمَلَهَا الرِّجَالُ عَلَى أَعْنَاقِهِمْ، فَإِنْ كَانَتْ صَالِحَةً قَالَتْ قَدِّمُونِي. وَإِنْ كَانَتْ غَيْرَ صَالِحَةٍ قَالَتْ يَا وَيْلَهَا أَيْنَ يَذْهَبُونَ بِهَا يَسْمَعُ صَوْتَهَا كُلُّ شَيْءٍ إِلاَّ الإِنْسَانَ، وَلَوْ سَمِعَهُ صَعِقَ». [رواه البخاري: ١٣١٤]

**668.** Əbu Səid əl-Xudri رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənazə (hazırlanıb mafəyə[1]) qoyulduğu və kişilər onu çiyinlərinə aldığı zaman, əgər ölən adam əməlisaleh olmuşdursa: "Məni tez aparın"– deyər, yox əgər pis adam olmuşdursa: "Vay halıma! Məni hara aparırsınız?"– deyər. Onun səsini insanlardan başqa hamı eşidər. Hərgah, insan bu səsi eşitsəydi, bayılıb yerə yıxılardı. (əl-Buxari, 1314)

## 30-cu fəsil. Cənazəni yeyin-yeyin aparmaq lazımdır

## ٣٠- باب: السُّرْعَةُ بِالْجِنَازَةِ

٦٦٩ - عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ: «أَسْرِعُوا بِالْجِنَازَةِ، فَإِنْ تَكُ صَالِحَةً فَخَيْرٌ تُقَدِّمُونَهَا إِلَيْهِ، وَإِنْ يَكُ سِوَى ذَلِكَ فَشَرٌّ تَضَعُونَهُ عَنْ رِقَابِكُمْ». [رواه البخاري: ١٣١٥]

**669.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənazəni (məzarlığa) yeyin-yeyin aparın! Əgər o, əməlisaleh olmuşdursa, siz onu xeyrə qovuşdurmuş olarsanız. Yox, əgər pis adam olmuşdursa, (tezliklə) şəri boynunuzdan atmış olarsınız." (əl-Buxari, 1315)

## 31-ci fəsil. Cənazənin ardınca getməyin fəziləti

## ٣١- باب: فَضْلُ اتِّبَاعِ الْجَنَائِزِ

٦٧٠ - عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ قِيلَ لَهُ: إِنَّ أَبَا هُرَيْرَةَ رضي الله عنه يَقُولُ مَنْ تَبِعَ جَنَازَةً فَلَهُ قِيرَاطٌ. فَقَالَ أَكْثَرَ أَبُو هُرَيْرَةَ عَلَيْنَا. فَصَدَّقَتْ عَائِشَةَ رضي الله عنها أَبَا هُرَيْرَةَ وَقَالَتْ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُهُ. فَقَالَ ابْنُ عُمَرَ رضي الله عنهما لَقَدْ فَرَّطْنَا فِي قَرَارِيطَ كَثِيرَةٍ. [رواه البخاري: ١٣٢٣-١٣٢٤]

**670.** Rəvayət edilir ki, ibn Ömərə رضي الله عنهما xəbər verdilər ki, Əbu Hureyra demişdir: "Cənazənin ardınca gedən kimsə bir qirat[2] savab qazanır." İbn Ömər dedi: "Əbu Hureyra (bunu) şişirdir." Lakin Aişə Əbu Hureyranın dediyini təsdiqləyib dedi: "Mən Peyğəmbərin ﷺ bunu söylədiyini eşitmişəm." Onda ibn Ömər dedi: "(Demək,) biz çox qiratlar itirmişik." (əl-Buxari, 1324-1325)

---

[1] İçərisinə tabut qoyulub aparılan xərək.

[2] 44-cü hədisə bax.

## 32-ci fəsil. Qəbirlərin üstündə ibadətgah tikməyin qadağan olunması haqqında

## ٣٢– باب:
## مَا يُكْرَهُ مِنِ اتِّخَاذِ الْمَسَاجِدِ عَلَى الْقُبُورِ

٦٧١ – عَنْ عَائِشَةَ ﵂ عَنِ النَّبِيِّ ﷺ قَالَ فِي مَرَضِهِ الَّذِي مَاتَ فِيهِ: «لَعَنَ اللَّهُ الْيَهُودَ وَالنَّصَارَى، اتَّخَذُوا قُبُورَ أَنْبِيَائِهِمْ مَسْجِدًا». قَالَتْ وَلَوْلاَ ذَلِكَ لأَبْرَزُوا قَبْرَهُ غَيْرَ أَنِّي أَخْشَى أَنْ يُتَّخَذَ مَسْجِدًا. [رواه البخاري: ١٣٣٠]

**671.** Aişə ﵂ rəvayət edir ki, Peyğəməbərin ﷺ vəfat etməsinə səbəb olan xəstəliyə tutulduğu zaman o demişdir: "Allah yəhudilərə və xristianlara lənət eləsin! Onlar peyğəmbərlərinin qəbirlərini ibadətgaha çevirmişlər."
Aişə ﵂ demişdir: "Peyğəməbər ﷺ bu sözü deməsəydi, müsəlmanlar onun qəbrini aşkarda saxlayardılar. Ancaq mən onun qəbrinin ibadətgaha çevrilməsindən qorxuram." (əl-Buxari, 135)

## 33-cü fəsil. Nifaslı[1] halda ölən qadına cənazə namazının qılınması

## ٣٣– باب:
## الصَّلاَةُ عَلَى النُّفَسَاءِ إِذَا مَاتَتْ فِي نِفَاسِهَا

٦٧٢ – عَنْ سَمُرَةَ بْنِ جُنْدَبٍ ﵁ قَالَ: صَلَّيْتُ وَرَاءَ النَّبِيِّ ﷺ عَلَى امْرَأَةٍ مَاتَتْ فِي نِفَاسِهَا، فَقَامَ عَلَيْهَا وَسَطَهَا. [رواه البخاري: ١٣٣١]

**672.** Rəvayət edilir ki, Səmura ibn Cundəb ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ arxasında dayanıb, nifaslı ikən ölmüş bir qadının cənazə namazını qıldım. Peyğəmbər ﷺ cənazənin orta[2] nahiyəsində durdu." (əl-Buxari, 1331)

## 34-cü fəsil. Cənazə namazında əl-Fatihə surəsini oxumaq

## ٣٤– باب:
## قِرَاءَةُ فَاتِحَةِ الْكِتَابِ عَلَى الْجَنَازَةِ

٦٧٣ – عَنِ ابْنِ عَبَّاسٍ ﵄ أَنَّهُ صَلَّى عَلَى جَنَازَةٍ فَقَرَأَ بِفَاتِحَةِ الْكِتَابِ فَقَالَ: لِيَعْلَمُوا أَنَّهَا سُنَّةٌ. [رواه البخاري: ١٣٣٥]

**673.** Rəvayət edilir ki, ibn Abbas ﵄ cənazə namazını qılarkən əl-Fatihə surəsini oxuduqdan sonra demişdir: "Qoy (camaat) bilsin ki, bu, sünnədir!" (əl-Buxari, 1335)

## 35-ci fəsil. Ölən adam ayaqqabıların səsini eşidir

## ٣٥– باب: الْمَيِّتُ يَسْمَعُ خَفْقَ النِّعَالِ

٦٧٤ – عَنْ أَنَسٍ ﵁ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «الْعَبْدُ إِذَا وُضِعَ فِي قَبْرِهِ، وَتُوُلِّيَ وَذَهَبَ أَصْحَابُهُ حَتَّى إِنَّهُ لَيَسْمَعُ قَرْعَ نِعَالِهِمْ، أَتَاهُ مَلَكَانِ فَأَقْعَدَاهُ فَيَقُولاَنِ لَهُ مَا كُنْتَ تَقُولُ فِي هَذَا الرَّجُلِ مُحَمَّدٍ ﷺ فَيَقُولُ أَشْهَدُ أَنَّهُ عَبْدُ اللَّهِ وَرَسُولُهُ. فَيُقَالُ انْظُرْ إِلَى مَقْعَدِكَ مِنَ النَّارِ، أَبْدَلَكَ اللَّهُ بِهِ مَقْعَدًا مِنَ الْجَنَّةِ – قَالَ النَّبِيُّ ﷺ فَيَرَاهُمَا جَمِيعًا – وَأَمَّا الْكَافِرُ

---

[1] Nifas, doğuşdan sonra qadının uşaqlığından gələn qandır.
[2] Kişi üçün cənazə namazı qılındıqda isə imam onun baş tərəfində durmalıdır.

– أَوِ الْمُنَافِقُ – فَيَقُولُ لاَ أَدْرِى، كُنْتُ أَقُولُ مَا يَقُولُ النَّاسُ. فَيُقَالُ لاَ دَرَيْتَ وَلاَ تَلَيْتَ. ثُمَّ يُضْرَبُ بِمِطْرَقَةٍ مِنْ حَدِيدٍ ضَرْبَةً بَيْنَ أُذُنَيْهِ، فَيَصِيحُ صَيْحَةً يَسْمَعُهَا مَنْ يَلِيهِ إِلاَّ الثَّقَلَيْنِ». [رواه البخاري: ١٣٣٨]

**674.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Bəndə qəbrə qoyulduğu və yoldaşları dönüb getdiyi zaman onların ayaqqabılarının səsini belə eşidir və həmin anda onun yanına iki mələk gəlib onu otuzdurur və ondan soruşurlar ki: “Bu Muhəmməd ﷺ deyilən adam haqqında nə deyə bilərsən?” O: “Mən şahidlik edirəm ki, Muhəmməd Allahın qulu və elçisidir”– deyə cavab verir. (Onda ona) deyirlər: “Cəhənnəm odundakı yerinə bax! Allah onun əvəzinə sənə Cənnətdə bir yer verdi.”

Peyğəmbər ﷺ deyir: “O adam hər iki yerini görür. Kafir və ya münafiqə gəldikdə isə, (verilən suala o belə) cavab verir: “Bilmirəm, mən insanların dediyini deyirdim.” (Onda ona) deyilir: “Sən (haqqı) başa düşməmisən və (Quran) oxumamısan!” Bundan sonra dəmir çəkiclə onun qulaqlarının arasına bir zərbə vurulur və o elə bağırır ki, cinlər və insanlar istisna olmaqla, yanındakıların hamısı onun səsini eşidir.” (əl-Buxari, 1338)

## 36-cı fəsil. Müqəddəs torpaqda və ya buna bənzər bir yerdə dəfn olunmaq istəyən kimsə haqqında

## ٣٦– باب: مَنْ أَحَبَّ الدَّفْنَ فِى الأَرْضِ الْمُقَدَّسَةِ أَوْ نَحْوِهَا

٦٧٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: «أُرْسِلَ مَلَكُ الْمَوْتِ إِلَى مُوسَى فَلَمَّا جَاءَهُ صَكَّهُ فَرَجَعَ إِلَى رَبِّهِ فَقَالَ أَرْسَلْتَنِى إِلَى عَبْدٍ لاَ يُرِيدُ الْمَوْتَ. فَرَدَّ اللَّهُ عَلَيْهِ عَيْنَهُ وَقَالَ ارْجِعْ فَقُلْ لَهُ يَضَعُ يَدَهُ عَلَى مَتْنِ ثَوْرٍ، فَلَهُ بِكُلِّ مَا غَطَّتْ بِهِ يَدُهُ بِكُلِّ شَعْرَةٍ سَنَةٌ. قَالَ أَىْ رَبِّ، ثُمَّ مَاذَا قَالَ ثُمَّ الْمَوْتُ. قَالَ فَالآنَ. فَسَأَلَ اللَّهَ أَنْ يُدْنِيَهُ مِنَ الأَرْضِ الْمُقَدَّسَةِ رَمْيَةً بِحَجَرٍ». قَالَ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «فَلَوْ كُنْتُ ثَمَّ لأَرَيْتُكُمْ قَبْرَهُ إِلَى جَانِبِ الطَّرِيقِ عِنْدَ الْكَثِيبِ الأَحْمَرِ». [رواه البخاري: ١٣٣٩]

**675.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Ölüm mələyi Musanın yanına göndərildi. Mələk Musanın yanına gəldikdə Musa onu vurdu (və onun gözü çıxdı[1]). Mələk Rəbbinin yanına qayıdıb dedi: “Sən məni ölmək istəməyən bir bəndənin yanına göndərdin.” Allah onun gözünü yerinə qaytardı və buyurdu: “Qayıt ona de ki: “Əlini öküzün belinə qoysun. Əlinə gələn tüklərin sayı qədər – hər bir tükün müqabilində bir il ömrü artacaq.” Musa dedi: “Ey Rəbbim! Sonra nə olacaq?” Allah buyurdu: “Sonra öləcəksən!” Musa dedi: “Elə isə indi (ölmək istəyirəm).” Sonra da Allahdan onu atılmış bir daşın uçub düşdüyü məsafə qədər müqəddəs torpağa yaxınlaşdırmasını dilədi.”

Əbu Hureyra rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Əgər orada olsaydım, sizə onun yolun kənarında, qırmızı qum təpəsinin yanında (yerləşən) qəbrini göstərərdim.” (əl-Buxari, 1339)

[1] Musa onun mələk olduğunu bilmirdi, çünki mələk onun yanına insan qiyafəsində gəlmiş və icazəsiz onun yanına daxil olmuşdu.

## 37-ci fəsil. Şəhidə cənazə namazı qılmaq

## ٣٧- باب: الصَّلاَةُ عَلَى الشَّهِيدِ

٦٧٦ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: كَانَ النَّبِيُّ ﷺ يَجْمَعُ بَيْنَ الرَّجُلَيْنِ مِنْ قَتْلَى أُحُدٍ فِي ثَوْبٍ وَاحِدٍ ثُمَّ يَقُولُ: «أَيُّهُمْ أَكْثَرُ أَخْذًا لِلْقُرْآنِ». فَإِذَا أُشِيرَ لَهُ إِلَى أَحَدِهِمَا قَدَّمَهُ فِي اللَّحْدِ وَقَالَ: «أَنَا شَهِيدٌ عَلَى هَؤُلاَءِ يَوْمَ الْقِيَامَةِ». وَأَمَرَ بِدَفْنِهِمْ فِي دِمَائِهِمْ، وَلَمْ يُغَسَّلُوا وَلَمْ يُصَلِّ عَلَيْهِمْ. [رواه البخاري: ١٣٤٣]

**676.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Uhud döyüşündə şəhid olanları iki-iki (hər iki nəfəri) bir kəfənə[1] büküb: "Hansı biri Qurandan daha çox (ayə) bilir"- deyə soruşur, ikisindən hansı birinə işarə edilirdisə, onu birinci olaraq qəbrə qoyur və deyirdi: "Mən Qiyamət günü bunlara şahid olacağam!" Sonra onları üzərilərindəki qanı (yumadan) dəfn etməyi əmr etdi. (Odur ki, əshabələr) onları yumadılar və cənazələri üçün namaz qılmadılar. (əl-Buxari, 1343)

٦٧٧ – عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ رضي الله عنه، أَنَّ النَّبِيَّ ﷺ خَرَجَ يَوْمًا فَصَلَّى عَلَى أَهْلِ أُحُدٍ صَلاَتَهُ عَلَى الْمَيِّتِ، ثُمَّ انْصَرَفَ إِلَى الْمِنْبَرِ فَقَالَ: «إِنِّي فَرَطٌ لَكُمْ، وَأَنَا شَهِيدٌ عَلَيْكُمْ، وَإِنِّي وَاللَّهِ لأَنْظُرُ إِلَى حَوْضِي الآنَ، وَإِنِّي أُعْطِيتُ مَفَاتِيحَ خَزَائِنِ الأَرْضِ – أَوْ مَفَاتِيحَ الأَرْضِ – وَإِنِّي وَاللَّهِ مَا أَخَافُ عَلَيْكُمْ أَنْ تُشْرِكُوا بَعْدِي، وَلَكِنْ أَخَافُ عَلَيْكُمْ أَنْ تَنَافَسُوا فِيهَا». [رواه البخاري: ١٣٤٤]

**677.** Uqbə ibn Amir رضي الله عنه rəvayət edir ki, bir gün Peyğəmbər ﷺ gedib Uhud şəhidləri üçün cənazə namazı qıldı. Sonra (Mədinəyə gəldi və) minbərə qalxıb dedi: "Mən sizi qabaqlayacağam (sizdən əvvəl bu dünyadan köçəcəyəm). Mən sizin nə etdiklərinizə şahidəm. Vallahi, indi mən hovuzumu görürəm. Həqiqətən, mənə yer üzünün xəzinələri (və ya açarları) verilmişdir. Vallahi, mən öldükdən sonra sizin Allaha şərik qoşacağınızdan qorxmuram. Mən sizin dünya (malına) görə bir-birinizlə rəqabət aparacağınızdan qorxuram." (əl-Buxari, 1344)

## 38-ci fəsil. İslamı qəbul etdikdən sonra vəfat etmiş uşaq üçün cənazə namazı qılınırmı? Habelə, uşaq ölüm ayağında ikən ona İslam dini ərz edilirmi?

## ٣٨- باب: إِذَا أَسْلَمَ الصَّبِيُّ فَمَاتَ، هَلْ يُصَلَّى عَلَيْهِ؟ وَ هَلْ يُعْرَضُ عَلَى الصَّبِيِّ الإِسْلاَمُ؟

٦٧٨ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ عُمَرَ رضي الله عنه انْطَلَقَ مَعَ النَّبِيِّ ﷺ فِي رَهْطٍ قِبَلَ ابْنِ صَيَّادٍ، حَتَّى وَجَدُوهُ يَلْعَبُ مَعَ الصِّبْيَانِ عِنْدَ أُطُمِ بَنِي مَغَالَةَ، وَقَدْ قَارَبَ ابْنُ صَيَّادٍ الْحُلُمَ فَلَمْ يَشْعُرْ حَتَّى ضَرَبَ النَّبِيُّ ﷺ بِيَدِهِ ثُمَّ قَالَ لاِبْنِ صَيَّادٍ: «تَشْهَدُ أَنِّي رَسُولُ اللَّهِ». فَنَظَرَ إِلَيْهِ ابْنُ صَيَّادٍ فَقَالَ أَشْهَدُ أَنَّكَ رَسُولُ الأُمِّيِّينَ. فَقَالَ ابْنُ صَيَّادٍ لِلنَّبِيِّ ﷺ أَتَشْهَدُ أَنِّي رَسُولُ اللَّهِ فَرَفَضَهُ وَقَالَ آمَنْتُ بِاللَّهِ وَبِرُسُلِهِ. فَقَالَ لَهُ: «مَاذَا تَرَى». قَالَ ابْنُ صَيَّادٍ يَأْتِينِي صَادِقٌ وَكَاذِبٌ. فَقَالَ النَّبِيُّ ﷺ: «خُلِّطَ عَلَيْكَ الأَمْرُ» ثُمَّ قَالَ لَهُ النَّبِيُّ ﷺ: «إِنِّي قَدْ خَبَأْتُ لَكَ خَبِيئًا». فَقَالَ ابْنُ صَيَّادٍ هُوَ

[1] Burada iki kişinin bir kəfənə büküldüyü, yaxud bir kəfəni iki hissəyə bölüb, onlardan hər birinin həmin hissəyə büküldüyü və eyni qəbirə qoyulduğu nəzərdə tutulur.

الدُّخُّ. فَقَالَ: «اخْسَأْ، فَلَنْ تَعْدُوَ قَدْرَكَ». فَقَالَ عُمَرُ ﷺ دَعْنِى يَا رَسُولَ اللَّهِ أَضْرِبْ عُنُقَهُ. فَقَالَ النَّبِىُّ ﷺ: «إِنْ يَكُنْهُ فَلَنْ تُسَلَّطَ عَلَيْهِ، وَإِنْ لَمْ يَكُنْهُ فَلاَ خَيْرَ لَكَ فِى قَتْلِه».

عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ: انْطَلَقَ بَعْدَ ذَلِكَ رَسُولُ اللَّهِ ﷺ وَأُبَىُّ بْنُ كَعْبٍ إِلَى النَّخْلِ الَّتِى فِيهَا ابْنُ صَيَّادٍ وَهُوَ يَخْتِلُ أَنْ يَسْمَعَ مِنِ ابْنِ صَيَّادٍ شَيْئًا قَبْلَ أَنْ يَرَاهُ ابْنُ صَيَّادٍ فَرَآهُ النَّبِىُّ ﷺ وَهُوَ مُضْطَجِعٌ، يَعْنِى فِى قَطِيفَةٍ لَهُ فِيهَا رَمْزَةٌ أَوْ زَمْرَةٌ، فَرَأَتْ أُمُّ ابْنِ صَيَّادٍ رَسُولَ اللَّهِ ﷺ وَهُوَ يَتَّقِى بِجُذُوعِ النَّخْلِ فَقَالَتْ لاِبْنِ صَيَّادٍ يَا صَافِ - وَهُوَ اسْمُ ابْنِ صَيَّادٍ - هَذَا مُحَمَّدٌ. فَثَارَ ابْنُ صَيَّادٍ فَقَالَ النَّبِىُّ ﷺ: «لَوْ تَرَكَتْهُ بَيَّنَ». [رواه البخاري: ١٣٥٤-١٣٥٥]

**678.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "(Bir dəfə) Ömər ﷺ Peyğəmbərlə ﷺ və başqa bir neçə adamla birlikdə ibn Sayyadın[1] yanına getdi. Onlar onu Bəni Məğalə qəbiləsinin istehkamı yanında uşaqlarla oynayan yerdə tapdılar. (O vaxt) ibn Sayyad artıq həddi-büluğa çatmışdı. Peyğəmbər ﷺ əli ilə (yavaşca ibn Sayyadın çiyninə) vuranadək o, (onların gəldiyini) hiss etmirdi. Peyğəmbər ﷺ ibn Sayyaddan soruşdu: "Sən mənim Allahın elçisi olduğuma şahidlik edirsənmi?" İbn Sayyad ona baxıb dedi: "Mən şahidlik edirəm ki, sən ümmilərə[2] göndərilmisən." Sonra ibn Sayyad Peyğəmbərdən ﷺ soruşdu: "Sən mənim Allahın elçisi olduğuma şahidlik edirsənmi?" Peyğəmbər ﷺ ona cavab verməyib dedi: "Mən Allaha və onun elçilərinə iman gətirmişəm!" Sonra ondan soruşdu: "(Yuxuda) nə görürsən?" İbn Sayyad dedi: "(Yuxuda) mənə həm doğru xəbərlər, həm də yalan xəbərlər gəlir." Peyğəmbər ﷺ dedi: "İşin qarışığa düşüb (gördüklərini şeytan sənə qarmaqarışıq göstərir)." Sonra Peyğəmbər ﷺ ona: "Sənin üçün fikrimdə bir şey tutmuşam"– dedi. İbn Sayyad: "Bu, əd-Duxdur[3]"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "İtil buradan! Sən heç vaxt həddini aşa bilməyəcəksən." Ömər ﷺ dedi: "Ya Rəsulullah, burax onun boynunu vurum." Peyğəmbər ﷺ buyurdu: "Əgər o, odursa[4], sən ona bata bilməyəcəksən, yox əgər o deyilsə, onu öldürməyinin sənə heç bir xeyri yoxdur."

Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Bundan sonra Peyğəmbər ﷺ və Ubey ibn Kəb ﷺ ibn Sayyadın olduğu xurma bağına getdilər. Peyğəmbər ﷺ istəyirdi ki, ibn Sayyad onu görmədiyi halda onun nə danışdığını eşitsin. Peyğəmbər ﷺ onun bürüncəyinə bürünüb uzandığını və əcaib səslər çıxartdığını gördü. (Bu vaxt) ibn Sayyadın anası Peyğəmbərin ﷺ xurma ağacının arxasında gizləndiyini görüb ibn Sayyada: "Ey Safi! (Bu ibn Sayyadın adıdır). Muhəmməd buradadır"– dedi və ibn Sayyad dərhal sıçrayıb ayağa qalxdı. Peyğəmbər ﷺ buyurdu: "Əgər qadın onu oyatmasaydı, (onun kim olduğu bizə) bəlli olardı." (əl-Buxari, 1354-1355)

٦٧٩ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ غُلاَمٌ يَهُودِىٌّ يَخْدُمُ النَّبِىَّ ﷺ فَمَرِضَ، فَأَتَاهُ النَّبِىُّ ﷺ يَعُودُهُ، فَقَعَدَ عِنْدَ رَأْسِهِ فَقَالَ لَهُ: «أَسْلِمْ». فَنَظَرَ إِلَى أَبِيهِ وَهُوَ عِنْدَهُ فَقَالَ لَهُ أَطِعْ أَبَا الْقَاسِمِ ﷺ. فَأَسْلَمَ ، فَخَرَجَ النَّبِىُّ ﷺ وَهُوَ يَقُولُ: «الْحَمْدُ لِلَّهِ الَّذِى أَنْقَذَهُ مِنَ النَّارِ». [رواه البخاري: ١٣٥٦]

---

[1] Bu, qeyri-adi zahiri görünüşü olan bir uşaq idi ki, əshabələr onun məsihi-dəccal olduğunu güman edirdilər.

[2] İbn Sayyad "ümmi" dedikdə, yazıb-oxumağı bacarmayan ərəbləri qəsd edir.

[3] Peyğəmbər ﷺ 44-cü surənin 10-cu ayəsindəki "əd-Duxan" (yəni duman) sözünü qəsd edirdi ki, bunu da ibn Sayyad düzgün tələffüz edə bilmədi. Beləliklə də, Peyğəmbər ﷺ şeytanın ona qarmaqarışıq sözlər təlqin etdiyini sübuta yetirdi.

[4] Peyğəmbər ﷺ bunu deməklə məsihi-dəccalı qəsd edir.

**679.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Peyğəmbərə ﷺ xidmət edən yəhudi bir uşaq xəstələnmişdi. Peyğəmbər ﷺ ona baş çəkməyə gəldi və onun baş tərəfində oturub ona: “Müsəlman ol!”– dedi. Uşaq, yanında durmuş atasının üzünə baxdı. Atası ona: “Əbul-Qasıma itaət et!”– dedi və uşaq İslamı qəbul etdi. Sonra Peyğəmbər ﷺ onun yanından çıxdı və dedi: “Onu oddan xilas edən Allaha həmd olsun!” (əl-Buxari, 1356)

٦٨٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَا مِنْ مَوْلُودٍ إِلاَّ يُولَدُ عَلَى الْفِطْرَةِ، فَأَبَوَاهُ يُهَوِّدَانِهِ أَوْ يُنَصِّرَانِهِ أَوْ يُمَجِّسَانِهِ، كَمَا تُنْتَجُ الْبَهِيمَةُ بَهِيمَةً جَمْعَاءَ، هَلْ تُحِسُّونَ فِيهَا مِنْ جَدْعَاءَ». ثُمَّ يَقُولُ أَبُو هُرَيْرَةَ ﷺ: ﴿ فَأَقِمْ وَجْهَكَ لِلدِّينِ حَنِيفًا فِطْرَتَ ٱللَّهِ ٱلَّتِى فَطَرَ ٱلنَّاسَ عَلَيْهَا لَا تَبْدِيلَ لِخَلْقِ ٱللَّهِ ذَٰلِكَ ٱلدِّينُ ٱلْقَيِّمُ ﴾ [رواه البخاري: ١٣٥٩]

**680.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər bir körpə fitrəti üzərində (tövhidə meyilli olaraq) doğulur. Sonra ata-anası onu ya yəhudi, ya xristian, ya da məcusi edir. Beləcə, heyvanlar da gözəl biçimdə yaranır. Heç sən onların arasında qulağı kəsik bir heyvan görürsənmi?” Sonra Əbu Hureyra ﷺ bu ayəni oxudu: “Hənif[1] olaraq üzünü dinə tərəf çevir! Allahın insanlara – xəlq etdiyi *şüurlu* məxluq kimi verdiyi fitrət budur. Allahın yaratdığını heç cür dəyişdirmək olmaz. Doğru din budur...[2]” (əl-Buxari, 1359)

## 39-cu fəsil. Allaha şərik qoşan adam ölümqabağı “Lə ilahə illəllah” deyərsə...

## ٣٩– باب: إِذَا قَالَ الْمُشْرِكُ عِنْدَ الْمَوْتِ لاَ إِلَهَ إِلاَّ اللَّهُ

٦٨١ – عَنْ الْمُسَيَّبِ بْنِ حَزْنٍ ﷺ قَالَ: لَمَّا حَضَرَتْ أَبَا طَالِبٍ الْوَفَاةُ جَاءَهُ رَسُولُ اللَّهِ ﷺ فَوَجَدَ عِنْدَهُ أَبَا جَهْلِ بْنَ هِشَامٍ، وَعَبْدَ اللَّهِ بْنَ أَبِي أُمَيَّةَ بْنِ الْمُغِيرَةِ، قَالَ رَسُولُ اللَّهِ ﷺ لأَبِي طَالِبٍ: «يَا عَمِّ، قُلْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، كَلِمَةً أَشْهَدُ لَكَ بِهَا عِنْدَ اللَّهِ». فَقَالَ أَبُو جَهْلٍ وَعَبْدُ اللَّهِ بْنُ أَبِي أُمَيَّةَ يَا أَبَا طَالِبٍ، أَتَرْغَبُ عَنْ مِلَّةِ عَبْدِ الْمُطَّلِبِ فَلَمْ يَزَلْ رَسُولُ اللَّهِ ﷺ يَعْرِضُهَا عَلَيْهِ، وَيَعُودَانِ بِتِلْكَ الْمَقَالَةِ، حَتَّى قَالَ أَبُو طَالِبٍ آخِرَ مَا كَلَّمَهُمْ هُوَ عَلَى مِلَّةِ عَبْدِ الْمُطَّلِبِ، وَأَبَى أَنْ يَقُولَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَمَا وَاللَّهِ لأَسْتَغْفِرَنَّ لَكَ، مَا لَمْ أُنْهَ عَنْكَ». فَأَنْزَلَ اللَّهُ تَعَالَى فِيهِ: ﴿ مَا كَانَ لِلنَّبِيِّ ﴾ الآيَةَ. [رواه البخاري: ١٣٦٠]

**681.** Rəvayət edilir ki, Museyyib ibn Həzn ﷺ demişdir: “Əbu Talib[3] ölüm ayağında ikən Peyğəmbər ﷺ onun yanına gəldi və orada Əbu Cəhl ibn Hişamı və Abdullah ibn Əbu Ümeyyə ibn Muğiranı[4] gördü. Peyğəmbər ﷺ Əbu Talibə dedi: “Əmi, “Lə ilahə illəllah” kəlməsini de ki, Allah yanında sənin (dediyinə) şahid olum.” Əbu Cəhl və Abdullah ibn Əbu Ümeyyə dedilər: “Ey Əbu Talib, Abdul-Muttəlibin[5] dinindən üz çevirməkmi istəyirsən?!” Peyğəmbər ﷺ tövhid kəlməsini, onlar da öz dediklərini ta o vaxta qədər təkrar etdilər ki, axırda Əbu Talib onlara son sözünü deyib Abdul-Muttəlibin dinində qalacağını bildirdi və “lə ilahə illəllah” deməkdən imtina etdi. Peyğəmbər ﷺ buyurdu: “Vallahi, mə-

---

[1] Batildən haqqa yönəlib Tək Allaha ibadət etmək.
[2] “ər-Rum” surəsi, 30.
[3] Əbu Talib Peyğəmbərin ﷺ əmisi və Əlinin ﷺ atası idi.
[4] Hər ikisi Peyğəmbərin ﷺ qatı düşməni idi.
[5] Abdul-Muttəlib Peyğəmbərin ﷺ babası və Əbu Talibin atasıdır.

nə qadağan edilənədək sənin üçün bağışlanma diləyəcəyəm." Onda Uca Allah onun barəsində bu ayəni nazil etdi: **"Müşriklərin Cəhənnəm sakinləri olduqları bəlli olduqdan sonra qohum olsalar belə, Peyğəmbərə və möminlərə onlar üçün bağışlanma diləmək yaraşmaz"[1].** (əl-Buxari, 1360)

## ٤٠– باب: مَوْعِظَةُ الْمُحَدِّث عِنْدَ الْقَبْرِ، وَقُعُودِ أَصْحَابِهِ حَوْلَهُ

## 40-cı fəsil. Nəsihət verən adam qəbrin yanında ikən, əshabələri də onun ətrafında oturduğu halda öyüd-nəsihət verə bilər

٦٨٢ – عَنْ عَلِيٍّ ﷺ قَالَ: كُنَّا فِى جَنَازَةٍ فِى بَقِيعِ الْغَرْقَدِ، فَأَتَانَا النَّبِىُّ ﷺ فَقَعَدَ وَقَعَدْنَا حَوْلَهُ، وَمَعَهُ مِخْصَرَةٌ فَنَكَّسَ، فَجَعَلَ يَنْكُتُ بِمِخْصَرَتِهِ ثُمَّ قَالَ: «مَا مِنْكُمْ مِنْ أَحَدٍ، مَا مِنْ نَفْسٍ مَنْفُوسَةٍ إِلاَّ كُتِبَ مَكَانُهَا مِنَ الْجَنَّةِ وَالنَّارِ، وَإِلاَّ قَدْ كُتِبَ شَقِيَّةً أَوْ سَعِيدَةً». فَقَالَ رَجُلٌ يَا رَسُولَ اللَّهِ، أَفَلاَ نَتَّكِلُ عَلَى كِتَابِنَا وَنَدَعُ الْعَمَلَ، فَمَنْ كَانَ مِنَّا مِنْ أَهْلِ السَّعَادَةِ فَسَيَصِيرُ إِلَى عَمَلِ أَهْلِ السَّعَادَةِ، وَأَمَّا مَنْ كَانَ مِنَّا مِنْ أَهْلِ الشَّقَاوَةِ فَسَيَصِيرُ إِلَى عَمَلِ أَهْلِ الشَّقَاوَةِ قَالَ: «أَمَّا أَهْلُ السَّعَادَةِ فَيُيَسَّرُونَ لِعَمَلِ السَّعَادَةِ، وَأَمَّا أَهْلُ الشَّقَاوَةِ فَيُيَسَّرُونَ لِعَمَلِ الشَّقَاوَةِ»، ثُمَّ قَرَأَ: ﴿فَأَمَّا مَنْ أَعْطَىٰ وَاتَّقَىٰ﴾ الآيَةَ. [رواه البخاري: ١٣٦٢]

**682.** Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Biz Bəqiul-ğarqadda[2] bir cənazənin dəfnində iştirak edərkən Peyğəmbər ﷺ bizim yanımıza gəlib oturdu, biz də onun ətrafında oturduq. Əlində əsa var idi. O, başını aşağı əydi və əlindəki əsanı yerə vurmağa başladı. Sonra buyurdu: "Sizin hər birinizin, habelə bütün bəşəriyyətin Cənnətdə və ya Cəhənnəmdə tutacağı yer (əzəldən qədərə) yazılmışdır. Həmçinin bədbəxt və ya xoşbəxt olacağı da yazılmışdır." (Bu vaxt) bir nəfər dedi: "Ey Allahın elçisi! Elə isə qədərimizə yazılana arxayın olub əməlləri tərk edəkmi? Onsuz da xoşbəxt olanımız xoşbəxt bəndələrin əməllərini yerinə yetirəcək, bədbəxt olanımız da bədbəxt bəndələrin əməllərini yerinə yetirəcək." Peyğəmbər ﷺ buyurdu: "Xoşbəxt olanlara xoşbəxt insanların əməli, bədbəxt olanlara isə bədbəxt insanların əməli müyəssər olacaq. Sonra Peyğəmbər ﷺ (bu ayələri) oxudu: "Kim (haqqı olanın haqqını) verir və *Allahdan* qorxursa və ən gözəl olan ("lə ilahə illəllah" kəlməsini) təsdiq edirsə, Biz onu ən asan olana nail edəcəyik. Kim də xəsislik edərək *Rəbbinə* ehtiyacı olmadığını güman edirsə və ən gözəl olan ("lə ilahə illəllah" kəlməsini) yalan hesab edirsə, Biz onun üstünə ən çətin olanı yükləyəcəyik."[3] (əl-Buxari, 1362)

## ٤١– باب: مَا جَاءَ فِى قَاتِلِ النَّفْسِ

## 41-ci fəsil. Öz canına qəsd edən kimsə haqqında deyilənlər

٦٨٣ – عَنْ ثَابِتِ بْنِ الضَّحَّاكِ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ حَلَفَ بِمِلَّةٍ غَيْرِ الإِسْلاَمِ كَاذِبًا مُتَعَمِّدًا فَهُوَ كَمَا قَالَ، وَمَنْ قَتَلَ نَفْسَهُ بِحَدِيدَةٍ عُذِّبَ بِهِ فِى نَارِ جَهَنَّمَ». [رواه البخاري: ١٣٦٣]

---

[1] "ət-Tovbə" surəsi, 113.

[2] Bəqiul-ğarqad Mədinə qəbirstanlığının adıdır. Bəqi – içində ağac kötüklərinin olduğu ərazi, ğarqad isə bu ərazidə bitən tikanlı bir ağacın adıdır.

[3] "əl-Leyl" surəsi, 5-10.

**683.** Sabit ibn Dəhhak ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bilə-bilə yalandan İslamdan başqa bir dində olduğuna and içsə, dediyi kimi olar. Kim dəmir alətlə özünü öldürərsə, Cəhənnəm odunda o alətlə ona əzab verilər." (əl-Buxari, 1363)

**٦٨٤** – عَنِ الْحَسَنِ حَدَّثَنَا جُنْدَبٌ ﷺ فِى هَذَا الْمَسْجِدِ فَمَا نَسِينَا، وَمَا نَخَافُ أَنْ يَكْذِبَ جُنْدَبٌ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «كَانَ بِرَجُلٍ جِرَاحٌ فَقَتَلَ نَفْسَهُ فَقَالَ اللَّهُ بَدَرَنِى عَبْدِى بِنَفْسِهِ حَرَّمْتُ عَلَيْهِ الْجَنَّةَ». [رواه البخاري: ١٣٦٤]

**684.** Həsən (əl-Bəsri) ﷺ demişdir: "Cundəb ﷺ bu məsciddə bizə bir hədis rəvayət etdi. Biz (bu hədisi) nə unutduq, nə də ki Cundəbin ﷺ Peyğəmbərin ﷺ adından yalan danışdığından ehtiyat edirik. Peyğəmbər ﷺ buyurmuşdur: "Bir nəfər yaralı idi. (Ağrıya dözə bilməyib) özünü öldürdü. Onda Allah buyurdu: "Qulum Məni qabaqlayıb (tələsərək) canına qəsd etdi, Mən də Cənnəti ona haram etdim." (əl-Buxari, 1364)

**٦٨٥** – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «الَّذِى يَخْنُقُ نَفْسَهُ يَخْنُقُهَا فِى النَّارِ، وَالَّذِى يَطْعُنُهَا يَطْعُنُهَا فِى النَّارِ». [رواه البخاري: ١٣٦٥]

**685.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bu dünyada) özünü boğan adam Cəhənnəmdə də özünü boğacaq, özünü (bıçaq və ya başqa ucu şiş bir alətlə) vuran adam Cəhənnəmdə də özünü vuracaq." (əl-Buxari, 1365)

## 42-ci fəsil. İnsanların ölən adamı tərifləməsi

## ٤٢ – باب: ثَنَاءُ النَّاسِ عَلَى الْمَيِّتِ

**٦٨٦** – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ يَقُولُ مَرُّوا بِجَنَازَةٍ فَأَثْنَوْا عَلَيْهَا خَيْرًا، فَقَالَ النَّبِىُّ ﷺ: «وَجَبَتْ». ثُمَّ مَرُّوا بِأُخْرَى فَأَثْنَوْا عَلَيْهَا شَرًّا فَقَالَ: «وَجَبَتْ». فَقَالَ عُمَرُ بْنُ الْخَطَّابِ ﷺ مَا وَجَبَتْ قَالَ: «هَذَا أَثْنَيْتُمْ عَلَيْهِ خَيْرًا فَوَجَبَتْ لَهُ الْجَنَّةُ، وَهَذَا أَثْنَيْتُمْ عَلَيْهِ شَرًّا فَوَجَبَتْ لَهُ النَّارُ، أَنْتُمْ شُهَدَاءُ اللَّهِ فِى الأَرْضِ». [رواه البخاري: ١٣٦٧]

**686.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) cənazə aparılarkən biz onu xoş sözlə yad edib təriflədik. Peyğəmbər ﷺ: "Vacib oldu!"– deyə buyurdu. Sonra başqa bir cənazə aparılarkən biz onu xoşagəlməz sözlə yad edib pislədik. Peyğəmbər ﷺ (yenə): "Vacib oldu!"– deyə buyurdu. Ömər ibn Xəttab: "Nə vacib oldu?"– deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Bunu xoş sözlərlə yad etdiniz, Cənnət ona vacib oldu. Bunu da xoşagəlməz sözlərlə yad etdiniz, Cəhənnəm ona vacib oldu. Siz Allahın yer üzündəki şahidlərisiniz!" (əl-Buxari, 1367)

**٦٨٧** – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «أَيُّمَا مُسْلِمٍ شَهِدَ لَهُ أَرْبَعَةٌ بِخَيْرٍ أَدْخَلَهُ اللَّهُ الْجَنَّةَ». فَقُلْنَا: وَثَلاَثَةٌ، قَالَ: «وَثَلاَثَةٌ». فَقُلْنَا: وَاثْنَانِ قَالَ: «وَاثْنَانِ». ثُمَّ لَمْ نَسْأَلْهُ عَنِ الْوَاحِدِ. [رواه البخاري: ١٣٦٨]

**687.** Ömər ibn Xəttab ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hansı bir müsəlmanın yaxşı əməl sahibi olduğuna dörd nəfər (müsəlman) şahidlik etsə, Allah onu Cənnətə daxil edər. Biz: "Bəs üç nəfər (olsa)?"– deyə soruşduq. O: "Üç nəfər də (olsa)"– deyə cavab verdi. Biz: "Bəs iki nəfər (olsa)?"– deyə soruşduq. O: "İki nəfər də (olsa)"– deyə cavab verdi. Bundan sonra biz artıq bir nəfər haqqında soruşmadıq. (əl-Buxari, 1368)

## 43-cü fəsil. Qəbir əzabı barəsində varid olanlar

## ٤٣- باب: مَا جَاءَ فِى عَذَابِ الْقَبْرِ

٦٨٨ – عَنْ الْبَرَاءِ بْنِ عَازِبٍ ﵁، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا أُقْعِدَ الْمُؤْمِنُ فِى قَبْرِهِ أُتِىَ، ثُمَّ شَهِدَ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ، فَذَلِكَ قَوْلُهُ: ﴿ يُثَبِّتُ ٱللَّهُ ٱلَّذِينَ ءَامَنُوا۟ بِٱلْقَوْلِ ٱلثَّابِتِ ﴾». [رواه البخاري: ١٣٦٩]

**688.** Bəra ibn Azib ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mömin qəbirdə otuzdurulduqdan sonra (onun yanına iki mələk) gəlir. Bundan sonra (mömin) Allahdan başqa ibadət haqqı olan məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şahidlik edir. Bu, Allahın (bu) kəlamıdır: "Allah iman gətirənləri dünya həyatında da, axirətdə də möhkəm sözlə sabit saxlayar. Allah zalımları sapdırar. Allah istədiyini edər."[1] (əl-Buxari, 1369)

٦٨٩ – عَنْ ابْنِ عُمَرَ ﵄ قَالَ: اطَّلَعَ النَّبِيُّ ﷺ عَلَى أَهْلِ الْقَلِيبِ فَقَالَ: «وَجَدْتُمْ مَا وَعَدَ رَبُّكُمْ حَقًّا». فَقِيلَ لَهُ تَدْعُو أَمْوَاتًا فَقَالَ: «مَا أَنْتُمْ بِأَسْمَعَ مِنْهُمْ وَلَكِنْ لاَ يُجِيبُونَ». [رواه البخاري: ١٣٧٠]

**689.** Rəvayət edilir ki, ibn Ömər ﵄ demişdir: "Peyğəmbər ﷺ quyuya atılanların[2] cəsədinə baxıb dedi: "Rəbbinizin sizə vəd etdiyinin haqq olduğunu gördünüzmü?" Ondan soruşdular: "Sən ölülərəmi xitab edirsən?" (Peyğəmbər ﷺ) buyurdu: "(İndi) onlar (məni) sizdən yaxşı eşidirlər, lakin cavab verə bilmirlər." (əl-Buxari, 1370)

٦٩٠ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: إِنَّمَا قَالَ النَّبِيُّ ﷺ: «إِنَّهُمْ لَيَعْلَمُونَ الآنَ أَنَّ مَا كُنْتُ أَقُولُ حَقٌّ وَقَدْ قَالَ اللَّهُ تَعَالَى: ﴿ إِنَّكَ لَا تُسْمِعُ ٱلْمَوْتَىٰ ﴾». [رواه البخاري: ١٣٧١]

**690.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ (quyuya atılanlar barəsində) demişdir: "İndi onlar anlayırlar ki, mənim dediklərim haqdır. Uca Allah buyurur: "Sözsüz ki, sən nə ölülərə *haqqı* eşitdirə bilərsən, nə də dönüb gedən karlara çağırışı çatdıra bilərsən."[3] (əl-Buxari, 1371)

٦٩١ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِى بَكْرٍ ﵄ تَقُولُ: قَامَ رَسُولُ اللَّهِ ﷺ خَطِيبًا فَذَكَرَ فِتْنَةَ الْقَبْرِ الَّتِى يَفْتَتِنُ فِيهَا الْمَرْءُ، فَلَمَّا ذَكَرَ ذَلِكَ ضَجَّ الْمُسْلِمُونَ ضَجَّةً. [رواه البخاري: ١٣٧٣]

**691.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr ﵄ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ qalxıb xütbə verdi və (hər bir) insanın qəbirdə imtahan olunacağı barədə söhbət açdı. Bunu deyəndə müsəlmanlar (qorxudan) qışqırdılar." (əl-Buxari, 1373)

## 44-cü fəsil. Qəbir əzabından (Allaha) sığınmaq

## ٤٤- باب: التَّعَوُّذُ مِنْ عَذَابِ الْقَبْرِ

٦٩٢ – عَنْ أَبِى أَيُّوبَ ﵁ قَالَ: خَرَجَ النَّبِيُّ ﷺ وَقَدْ وَجَبَتِ الشَّمْسُ، فَسَمِعَ صَوْتًا فَقَالَ: «يَهُودُ تُعَذَّبُ فِى قُبُورِهَا». [رواه البخاري: ١٣٧٥]

---

[1] "İbrahim" surəsi, 27.

[2] Bunlar Bədr döyüşündə öldürülmüş və cəsədləri boş qalmış bir quyuya atılmış Məkkə müşrikləri idi.

[3] "ən-Nəml" surəsi, 80.

**692.** Rəvayət edilir ki, Əbu Əyyub ﷺ demişdir: “(Bir dəfə) günəş batdıqdan sonra Peyğəmbər ﷺ (evdən) çıxdı və bir səs eşidib dedi: “(Bunlar) qəbirlərində əzab çəkən yəhudilərdir.” (əl-Buxari, 1375)

**٦٩٣** – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَدْعُو: «اللَّهُمَّ إِنِّى أَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ، وَمِنْ عَذَابِ النَّارِ، وَمِنْ فِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ، وَمِنْ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ». [رواه البخاري: ١٣٧٧]

**693.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ dua edib[1] deyərdi: “Allahım! qəbir əzabından, Cəhənnəm əzabından, həyatın və ölümün fitnəsindən, məsihid-dəccalın fitnəsindən Sənə sığınıram!” (əl-Buxari, 1377)

## 45-ci fəsil. Ölən adama səhər-axşam (Cənnətdə və ya Cəhənnəmdə olan) yeri göstərilir

## ٤٥– باب: الْمَيِّتُ يُعْرَضُ عَلَيْهِ بِالْغَدَاةِ وَالْعَشِيِّ

**٦٩٤** – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِنَّ أَحَدَكُمْ إِذَا مَاتَ عُرِضَ عَلَيْهِ مَقْعَدُهُ بِالْغَدَاةِ وَالْعَشِيِّ، إِنْ كَانَ مِنْ أَهْلِ الْجَنَّةِ فَمِنْ أَهْلِ الْجَنَّةِ، وَإِنْ كَانَ مِنْ أَهْلِ النَّارِ فَمِنْ أَهْلِ النَّارِ، فَيُقَالُ هَذَا مَقْعَدُكَ حَتَّى يَبْعَثَكَ اللَّهُ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ١٣٧٩]

**694.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Biriniz öldükdən sonra səhər-axşam ona yeri göstərilir. Cənnət əhlindəndirsə, Cənnətlik, Cəhənnəm əhlindəndirsə, Cəhənnəmlik olacaq. Sonra (ona) deyilir: “Qiyamət günü Allah səni dirildənədək bu sənin qalacağın yer olacaq.” (əl-Buxari, 1379)

## 46-cı fəsil. Müsəlmanların (ölmüş) övladları haqqında deyilənlər

## ٤٦– باب: مَا قِيلَ فِى أَوْلَادِ الْمُسْلِمِينَ

**٦٩٥** – عَنْ الْبَرَاءِ ﷺ قَالَ: لَمَّا تُوُفِّيَ إِبْرَاهِيمُ ﷺ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّ لَهُ مُرْضِعًا فِى الْجَنَّةِ». [رواه البخاري: ١٣٨٢]

**695.** Rəvayət edilir ki, Bəra ﷺ demişdir: “İbrahim ﷺ vəfat etdikdə Peyğəmbər ﷺ demişdir: “Cənnətdə onun süd anası var!” (əl-Buxari, 1382)

## 47-ci fəsil. Müşriklərin (ölmüş) uşaqları haqqında deyilənlər

## ٤٧– باب: مَا قِيلَ فِى أَوْلَادِ الْمُشْرِكِينَ

**٦٩٦** – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: سُئِلَ رَسُولُ اللَّهِ ﷺ عَنْ أَوْلَادِ الْمُشْرِكِينَ فَقَالَ: «اللَّهُ إِذْ خَلَقَهُمْ أَعْلَمُ بِمَا كَانُوا عَامِلِينَ». [رواه البخاري: ١٣٨٣]

[1] Burada namaz əsnasında salamlardan əvvəl dua oxumaq qəsd edilir.
Duanın transkripsiyası: Allahummə inni əuzu bikə min əzabil-qabri və min əzabin-nari və min fitnətil-məhyə vəl-məmati və min fitnətil-məsihid-dəccal.

**696.** Rəvayət edilir ki, ibn Abbas ﵄ demişdir: "Peyğəmbərdən ﷺ müşriklərin uşaqları haqqında soruşdular. O buyurdu: "Allah onları yaratdığı zaman onların nə əməllər edəcəklərini yaxşı bilir." (əl-Buxari, 1383)

## 48-ci fəsil

## ٤٨ – باب

٦٩٧ – عَنْ سَمُرَةَ بْنِ جُنْدَبٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا صَلَّى صَلاَةً أَقْبَلَ عَلَيْنَا بِوَجْهِهِ فَقَالَ: «مَنْ رَأَى مِنْكُمُ اللَّيْلَةَ رُؤْيَا». قَالَ فَإِنْ رَأَى أَحَدٌ قَصَّهَا، فَيَقُولُ مَا شَاءَ اللَّهُ، فَسَأَلَنَا يَوْمًا، فَقَالَ: «هَلْ رَأَى أَحَدٌ مِنْكُمْ رُؤْيَا»، قُلْنَا لاَ، قَالَ: «لَكِنِّى رَأَيْتُ اللَّيْلَةَ رَجُلَيْنِ أَتَيَانِى فَأَخَذَا بِيَدِى، فَأَخْرَجَانِى إِلَى الأَرْضِ الْمُقَدَّسَةِ، فَإِذَا رَجُلٌ جَالِسٌ، وَرَجُلٌ قَائِمٌ بِيَدِهِ كَلُّوبٌ مِنْ حَدِيدٍ يُدْخِلُ ذَلِكَ الْكَلُّوبَ فِى شِدْقِهِ، حَتَّى يَبْلُغَ قَفَاهُ، ثُمَّ يَفْعَلُ بِشِدْقِهِ الآخَرِ مِثْلَ ذَلِكَ، وَيَلْتَئِمُ شِدْقُهُ هَذَا، فَيَعُودُ فَيَصْنَعُ مِثْلَهُ. قُلْتُ مَا هَذَا قَالاَ انْطَلِقْ. فَانْطَلَقْنَا حَتَّى أَتَيْنَا عَلَى رَجُلٍ مُضْطَجِعٍ عَلَى قَفَاهُ، وَرَجُلٌ قَائِمٌ عَلَى رَأْسِهِ بِفِهْرٍ أَوْ صَخْرَةٍ، فَيَشْدَخُ بِهِ رَأْسَهُ، فَإِذَا ضَرَبَهُ تَدَهْدَهَ الْحَجَرُ، فَانْطَلَقَ إِلَيْهِ لِيَأْخُذَهُ، فَلاَ يَرْجِعُ إِلَى هَذَا حَتَّى يَلْتَئِمَ رَأْسُهُ، وَعَادَ رَأْسُهُ كَمَا هُوَ، فَعَادَ إِلَيْهِ فَضَرَبَهُ، قُلْتُ مَنْ هَذَا قَالاَ انْطَلِقْ. فَانْطَلَقْنَا إِلَى ثَقْبٍ مِثْلِ التَّنُّورِ، أَعْلاَهُ ضَيِّقٌ وَأَسْفَلُهُ وَاسِعٌ، يَتَوَقَّدُ تَحْتَهُ نَارًا، فَإِذَا اقْتَرَبَ ارْتَفَعُوا حَتَّى كَادَ أَنْ يَخْرُجُوا، فَإِذَا خَمَدَتْ رَجَعُوا فِيهَا، وَفِيهَا رِجَالٌ وَنِسَاءٌ عُرَاةٌ. فَقُلْتُ مَنْ هَذَا قَالاَ انْطَلِقْ. فَانْطَلَقْنَا حَتَّى أَتَيْنَا عَلَى نَهَرٍ مِنْ دَمٍ، فِيهِ رَجُلٌ قَائِمٌ عَلَى وَسَطِ النَّهَرِ رَجُلٌ بَيْنَ يَدَيْهِ حِجَارَةٌ، فَأَقْبَلَ الرَّجُلُ الَّذِى فِى النَّهَرِ، فَإِذَا أَرَادَ أَنْ يَخْرُجَ رَمَى الرَّجُلُ بِحَجَرٍ فِى فِيهِ، فَرَدَّهُ حَيْثُ كَانَ، فَجَعَلَ كُلَّمَا جَاءَ لِيَخْرُجَ رَمَى فِى فِيهِ بِحَجَرٍ، فَيَرْجِعُ كَمَا كَانَ. فَقُلْتُ مَا هَذَا قَالاَ انْطَلِقْ. فَانْطَلَقْنَا حَتَّى انْتَهَيْنَا إِلَى رَوْضَةٍ خَضْرَاءَ، فِيهَا شَجَرَةٌ عَظِيمَةٌ، وَفِى أَصْلِهَا شَيْخٌ وَصِبْيَانٌ، وَإِذَا رَجُلٌ قَرِيبٌ مِنَ الشَّجَرَةِ بَيْنَ يَدَيْهِ نَارٌ يُوقِدُهَا، فَصَعِدَا بِى فِى الشَّجَرَةِ، وَأَدْخَلاَنِى دَارًا لَمْ أَرَ قَطُّ أَحْسَنَ مِنْهَا، فِيهَا رِجَالٌ شُيُوخٌ وَشَبَابٌ، وَنِسَاءٌ وَصِبْيَانٌ، ثُمَّ أَخْرَجَانِى مِنْهَا فَصَعِدَا بِى الشَّجَرَةَ فَأَدْخَلاَنِى دَارًا هِىَ أَحْسَنُ وَأَفْضَلُ، فِيهَا شُيُوخٌ وَشَبَابٌ. قُلْتُ طَوَّفْتُمَانِى اللَّيْلَةَ، فَأَخْبِرَانِى عَمَّا رَأَيْتُ. قَالاَ نَعَمْ، أَمَّا الَّذِى رَأَيْتَهُ يُشَقُّ شِدْقُهُ فَكَذَّابٌ يُحَدِّثُ بِالْكَذْبَةِ، فَتُحْمَلُ عَنْهُ حَتَّى تَبْلُغَ الآفَاقَ، فَيُصْنَعُ بِهِ إِلَى يَوْمِ الْقِيَامَةِ. وَالَّذِى رَأَيْتَهُ يُشْدَخُ رَأْسُهُ فَرَجُلٌ عَلَّمَهُ اللَّهُ الْقُرْآنَ، فَنَامَ عَنْهُ بِاللَّيْلِ، وَلَمْ يَعْمَلْ فِيهِ بِالنَّهَارِ، يُفْعَلُ بِهِ إِلَى يَوْمِ الْقِيَامَةِ. وَالَّذِى رَأَيْتَهُ فِى الثَّقْبِ فَهُمُ الزُّنَاةُ. وَالَّذِى رَأَيْتَهُ فِى النَّهَرِ آكِلُو الرِّبَا. وَالشَّيْخُ فِى أَصْلِ الشَّجَرَةِ إِبْرَاهِيمُ عليه السلام وَالصِّبْيَانُ حَوْلَهُ فَأَوْلاَدُ النَّاسِ، وَالَّذِى يُوقِدُ النَّارَ مَالِكٌ خَازِنُ النَّارِ. وَالدَّارُ الأُولَى الَّتِى دَخَلْتَ دَارُ عَامَّةِ الْمُؤْمِنِينَ، وَأَمَّا هَذِهِ الدَّارُ فَدَارُ الشُّهَدَاءِ، وَأَنَا جِبْرِيلُ، وَهَذَا مِيكَائِيلُ، فَارْفَعْ رَأْسَكَ، فَرَفَعْتُ رَأْسِى فَإِذَا فَوْقِى مِثْلُ السَّحَابِ. قَالاَ ذَاكَ مَنْزِلُكَ. قُلْتُ دَعَانِى أَدْخُلْ مَنْزِلِى. قَالاَ إِنَّهُ بَقِىَ لَكَ عُمْرٌ لَمْ تَسْتَكْمِلْهُ، فَلَوِ اسْتَكْمَلْتَ أَتَيْتَ مَنْزِلَكَ». [رواه البخاري: ١٣٨٦]

**697.** Rəvayət edilir ki, Səmura ibn Cundəb ﷺ demişdir: "Peyğəmbər ﷺ (çox vaxt sübh) namazını qıldıqdan sonra üzünü bizə tərəf çevirib: "Sizlərdən kim bu gecə yuxu görüb?"– deyə soruşardı. Yuxu görən adam öz yuxusunu danışar, o da ona: "Allahın istədiyi oldu!"– deyərdi. Bir gün yenə soruşdu: "Sizlərdən bu gecə yuxu görən olubmu?" Biz: "Xeyr!"– deyə cavab verdik. Dedi: "Mən isə bu gecə yuxuda iki nəfər gördüm. Onlar mənim yanıma gəldilər və əlimdən tutub müqəddəs torpağa[1] apardılar. Bir də gördüm ki, bir nəfər yerdə oturub, başqa

[1] Müqəddəs torpaq deyildikdə, Beytül-Müqəddəs və ya Şam nəzərdə tutulur.

birisi də əlində dəmir qarmaq (onun başı üstündə) dayanıb. O, qarmağı oturan adamın orduna[1] soxub onun ağzının bir tərəfini qafasına qədər cırır, sonra da bu qaydada onun ağzının digər tərəfini cırırdı. (Bu əsnada) ağzının (əvvəl) cırılan tərəfi sağalır və o, təzədən həmin tərəfi cırırdı. Mən: "Bu nədir?"– deyə soruşdum. O iki nəfər (mənə): "Get!"– dedi. Biz yolumuza davam etdik. Nəhayət, arxası üstə yerə uzanmış bir nəfərin yanına gəldik. Onun başı üstündə başqa birisi dayanmışdı, əlində də böyük bir daş var idi. O, bu daşla uzanmış adamın başını əzirdi. Daşı (hər dəfə) onun başına vurduqda daş yumbalanıb gedirdi. Gedib daşı götürüb uzanan adamın yanına qayıdanadək onun başı bitişərək əvvəlki halına qayıdırdı. Adam gəlib yenə onun başını əzirdi. Mən: "Bu kimdir?"– deyə soruşdum. (Mənə): "Get!"– dedilər. Biz yolumuza davam etdik. Nəhayət, gəlib təndirə bənzər, üstü dar, altı geniş bir oyuğa çatdıq. Bu oyuğun altında atəş alovlanırdı. Alov hər dəfə (günahkarlara) yaxınlaşdıqda onlar yuxarı qalxırdılar, hətta, az qalırdı ki, oradan bayıra çıxsınlar, alov səngidikdə isə geri çəkilirdilər. Orada lüt kişi və qadınlar var idi. Mən: "Bunlar kimdir?"– deyə soruşdum. (Mənə): "Get!"– dedilər. Biz yolumuza davam etdik. Nəhayət, gəlib (suyu) qandan olan bir çaya çatdıq. Çayın ortasında bir nəfər durmuşdu. Kənarında isə başqa birisi dayanmışdı, qarşısında da çoxlu daşlar var idi. Çayın içindəki adam sahilə çıxmaq istədikdə sahildəki adam daşla onun ağzından vurur və o, öz yerinə qayıdırdı. Beləcə, o hər dəfə sahilə çıxmaq istədikdə sahildəki adam daşla onun ağzından vurur və o, öz yerinə qayıdırdı. Mən: "Bu nədir?"– deyə soruşdum. (Mənə): "Get!"– dedilər. Biz yolumuza davam etdik. Nəhayət, yaşıl bir bağa çatdıq. Bağda böyük bir ağac var idi. Ağacın dibində ixtiyar bir qoca və bir dəstə uşaq var idi. Bir nəfər də ağacın yanında oturub qarşısındakı odu alovlandırırdı. Sonra (yoldaşlarım) məni ağaca qaldırdılar və məni elə bir evə daxil etdilər ki, indiyədək bundan gözəlini görməmişdim. Orada qocalar, cavanlar, qadınlar və uşaqlar var idi. Sonra məni oradan çıxardıb bir az da yuxarı qaldırdılar və əvvəlkindən daha gözəl və daha yaxşı bir evə daxil etdilər. Orada qocalar və cavanlar var idi. Mən (o iki nəfərə) dedim: "Bu gecə siz məni çox gəzdirdiniz. İndi isə mənə gördüklərim barədə xəbər verin." Onlar dedilər: "Bəli! Ağzı cırılan adama gəlincə, o, bir yalançıdır. (Dünyada ikən) o, yalan danışardı və onun bu yalanı hər tərəfə yayılardı. Qiyamət gününədək onun ağzı beləcə cırılacaq. Başı əzilən adam isə o kimsədir ki, Allah ona Quranı öyrətmiş, lakin o gecələr yatmış[2], gündüzlər isə onun içindəkilərə əməl etməmişdir. Qiyamət gününədək onun başı beləcə əziləcək. Dəlikdə gördüyün adamlar zinakarlardır. Çayın içində gördüklərin isə sələm yeyənlərdir. Ağacın dibindəki ixtiyar qoca İbrahim ﷺ, ətrafındakı uşaqlar isə insanların övladlarıdır. Odu alovlandıran Cəhənnəmin gözətçisi – Malikdir. Daxil olduğun birinci ev bütün möminlərin evi, bu gördüyün ev isə şəhidlərin evidir. Mən Cəbrailəm, bu da Mikaildir. Qaldır başını". Mən yuxarı baxıb başım üzərində buluda bənzər bir şey gördüm. Onlar: "Bu sənin mənzilindir"– dedilər. Mən dedim: "Qoyun mən öz mənzilimə daxil olum!" Onlar dedilər: "Sənin hələ tamamlamadığın ömrün qalıb. Əgər ömrünü tamamlamış olsaydın, mənzilinə girərdin." (əl-Buxari, 1386)

[1] Ağız boşluğunun yanaqlar tərəfində olan hissələrindən biri.
[2] Burada gecə namazına qalxmamaq nəzərdə tutulur.

## 49-cu fəsil. Qəfil ölüm

## ٤٩- باب: مَوْتُ الْفَجْأَةِ

٦٩٨ – عَنْ عَائِشَةَ رضي الله عنها، أَنَّ رَجُلاً قَالَ لِلنَّبِيِّ ﷺ إِنَّ أُمِّي افْتُلِتَتْ نَفْسُهَا، وَأَظُنُّهَا لَوْ تَكَلَّمَتْ تَصَدَّقَتْ، فَهَلْ لَهَا أَجْرٌ إِنْ تَصَدَّقْتُ عَنْهَا قَالَ: «نَعَمْ». [رواه البخاري: ١٣٨٨]

**698.** Aişə رضي الله عنها rəvayət edir ki, bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "Anam qəfil vəfat etdi. Güman edirəm ki, əgər o, danışmağa macal tapsaydı, (malından) sədəqə verməyi vəsiyyət edərdi. Əgər mən onun əvəzinə sədəqə versəm, (bundan ona) savab çatarmı?" Peyğəmbər ﷺ: "Bəli!"– deyə cavab verdi. (əl-Buxari, 1388)

## 50-ci fəsil. Peyğəmbərin ﷺ, Əbu Bəkrin رضي الله عنه və Ömərin رضي الله عنه qəbirləri haqqında deyilənlər

## ٥٠- باب: مَا جَاءَ فِي قَبْرِ النَّبِيِّ ﷺ وَأَبِي بَكْرٍ وَعُمَرَ رضي الله عنهما

٦٩٩ – عَنْهَا رضي الله عنها قَالَتْ: إِنْ كَانَ رَسُولُ اللَّهِ ﷺ لَيَتَعَذَّرُ فِي مَرَضِهِ أَيْنَ أَنَا الْيَوْمَ أَيْنَ أَنَا غَدًا اسْتِبْطَاءً لِيَوْمِ عَائِشَةَ، فَلَمَّا كَانَ يَوْمِي قَبَضَهُ اللَّهُ بَيْنَ سَحْرِي وَنَحْرِي، وَدُفِنَ فِي بَيْتِي. [رواه البخاري: ١٣٨٩]

**699.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ (ölümündən qabaq) xəstələndiyi zaman (Aişənin yanında qalmağı) çox istədiyindən tez-tez: "Bu gün mən harada qalacağam? Sabah mən harada qalacağam?"– deyə Aişənin رضي الله عنها yanında qalacağı günü səbirsizliklə gözləyirdi. (Nəhayət) o, mənim yanımda qaldığı gün başı mənim qucağımda ikən vəfat etdi və mənim evimdə dəfn edildi." (əl-Buxari, 1389)

٧٠٠ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رضي الله عنه أَنَّهُ قَالَ: إِنِّي لاَ أَعْلَمُ أَحَدًا أَحَقَّ بِهَذَا الأَمْرِ مِنْ هَؤُلاَءِ النَّفَرِ الَّذِينَ تُوُفِّيَ رَسُولُ اللَّهِ ﷺ وَهُوَ عَنْهُمْ رَاضٍ، فَمَنِ اسْتَخْلَفُوا بَعْدِي فَهُوَ الْخَلِيفَةُ، فَاسْمَعُوا لَهُ وَأَطِيعُوا. فَسَمَّى عُثْمَانَ وَعَلِيًّا وَطَلْحَةَ وَالزُّبَيْرَ وَعَبْدَ الرَّحْمَنِ بْنَ عَوْفٍ وَسَعْدَ بْنَ أَبِي وَقَّاصٍ رضي الله عنهم. [رواه البخاري: ١٣٩٢]

**700.** Rəvayət edilir ki, Ömər ibn Xəttab رضي الله عنه demişdir: "Mən bu işdə[1] onlardan daha layiqli olanını tanımıram. (Onlar) o kəslərdir ki, Peyğəmbər ﷺ onlardan razı qaldığı halda vəfat etmişdir. Onlar məndən sonra kimi xəlifə seçsələr, o da xəlifə olacaq. Onu eşidin və (ona) itaət edin!" Sonra Ömər Osmanın, Əlinin, Təlhənin, Zubeyrin, Abdur-Rəhman ibn Aufun və Səd ibn Vəqqasın رضي الله عنهم adını çəkdi. (əl-Buxari, 1392)

## 51-ci fəsil. Ölüləri söyməyin qadağan olunması

## ٥١- باب: مَا يُنْهَى مِنْ سَبِّ الأَمْوَاتِ

٧٠١ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: قَالَ النَّبِيُّ ﷺ: «لاَ تَسُبُّوا الأَمْوَاتَ فَإِنَّهُمْ قَدْ أَفْضَوْا إِلَى مَا قَدَّمُوا». [رواه البخاري: ١٣٩٣]

**701.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ölüləri söyməyin! Çünki onlar etdikləri əməllərə (görə öz aqibətinə) qovuşmuşlar." (əl-Buxari, 1393)

[1] Yəni, Ömər رضي الله عنه vəfat etdikdən sonra xəlifə seçməkdə.

# ٢٤ – كِتَابُ الزَّكَاةِ

# 24 – Zəkat kitabı

## ١– باب: وُجُوبُ الزَّكَاةِ

## 1-ci fəsil. Zəkatın vacibliyi

٧٠٢ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ بَعَثَ مُعَاذًا رضي الله عنه إِلَى الْيَمَنِ فَقَالَ: «ادْعُهُمْ إِلَى شَهَادَةِ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَنِّى رَسُولُ اللَّهِ، فَإِنْ هُمْ أَطَاعُوا لِذَلِكَ فَأَعْلِمْهُمْ أَنَّ اللَّهَ قَدِ افْتَرَضَ عَلَيْهِمْ خَمْسَ صَلَوَاتٍ فِى كُلِّ يَوْمٍ وَلَيْلَةٍ، فَإِنْ هُمْ أَطَاعُوا لِذَلِكَ فَأَعْلِمْهُمْ أَنَّ اللَّهَ افْتَرَضَ عَلَيْهِمْ صَدَقَةً فِى أَمْوَالِهِمْ، تُؤْخَذُ مِنْ أَغْنِيَائِهِمْ وَتُرَدُّ عَلَى فُقَرَائِهِمْ». [رواه البخاري: ١٣٩٥]

**702.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Muaz ibn Cəbəli رضي الله عنه Yəmənə göndərərkən demişdir: "Onları Allahdan başqa məbudun olmadığını və mənim Allahın elçisi olduğumu qəbul etməyə dəvət et. Əgər bunu qəbul etsələr, onlara bildir ki, Allah onlara gecə və gündüz beş vaxt namaz qılmağı vacib buyurmuşdur. Bunu da qəbul etsələr, onlara bildir ki, Allah onlara mallarından zəkat verməyi – dövlətlilərindən götürüb kasıblara paylamağı vacib buyurmuşdur." (əl-Buxari, 1395)

٧٠٣ – عَنْ أَبِى أَيُّوبَ رضي الله عنه أَنَّ رَجُلاً قَالَ لِلنَّبِىِّ ﷺ أَخْبِرْنِى بِعَمَلٍ يُدْخِلُنِى الْجَنَّةَ. قَالَ مَا لَهُ مَا لَهُ؟ وَقَالَ النَّبِىُّ ﷺ: «أَرَبٌ مَالَهُ، تَعْبُدُ اللَّهَ، وَلاَ تُشْرِكُ بِهِ شَيْئًا، وَتُقِيمُ الصَّلاَةَ، وَتُؤْتِى الزَّكَاةَ، وَتَصِلُ الرَّحِمَ». [رواه البخاري: ١٣٩٦]

**703.** Əbu Əyyub رضي الله عنه rəvayət edir ki, bir nəfər Peyğəmbərə ﷺ dedi: "Mənə Cənnətə girməyimə səbəb olacaq əməl barədə xəbər ver." (Əshabələr): "Ona nə olub? Ona nə olub?"– deyə soruşdular. Peyğəmər ﷺ buyurdu: "O (bilmədiyini öyrənmək) istəyir. Allaha ibadət et və Ona heç kəsi şərik qoşma, namaz qıl, zəkat ver və qohumluq əlaqələrini saxla!" (əl-Buxari, 1396)

٧٠٤ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ أَعْرَابِيًّا أَتَى النَّبِىَّ ﷺ فَقَالَ دُلَّنِى عَلَى عَمَلٍ إِذَا عَمِلْتُهُ دَخَلْتُ الْجَنَّةَ. قَالَ: «تَعْبُدُ اللَّهَ لاَ تُشْرِكُ بِهِ شَيْئًا، وَتُقِيمُ الصَّلاَةَ الْمَكْتُوبَةَ، وَتُؤَدِّى الزَّكَاةَ الْمَفْرُوضَةَ، وَتَصُومُ رَمَضَانَ». قَالَ: وَالَّذِى نَفْسِى بِيَدِهِ لاَ أَزِيدُ عَلَى هَذَا. فَلَمَّا وَلَّى قَالَ النَّبِىُّ ﷺ: «مَنْ سَرَّهُ أَنْ يَنْظُرَ إِلَى رَجُلٍ مِنْ أَهْلِ الْجَنَّةِ فَلْيَنْظُرْ إِلَى هَذَا». [رواه البخاري: ١٣٩٧]

**704.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Mənə elə bir əməl öyrət ki, ona əməl edəcəyim təqdirdə Cənnətə daxil olum." Peyğəmbər ﷺ buyurdu: "Allaha ibadət et və Ona heç kəsi şərik qoşma, fərz buyrulmuş namazları qıl, vacib buyrulmuş zəkatı ver və ramazan ayını oruc tut!" Bədəvi dedi: "Canım Əlində olan Allaha and olsun ki, bundan artıq heç nə edən deyiləm." O gedəndən sonra Peyğəmbər ﷺ buyurdu: "Cənnət əhlindən olan bir adama baxıb zövq almaq istəyəninizi varsa, qoy buna baxsın." (əl-Buxari, 1397)

٧٠٥ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: لَمَّا تُوُفِّى رَسُولُ اللَّهِ ﷺ وَكَانَ أَبُو بَكْرٍ رضي الله عنه وَكَفَرَ مَنْ كَفَرَ مِنَ الْعَرَبِ فَقَالَ عُمَرُ رضي الله عنه كَيْفَ تُقَاتِلُ النَّاسَ، وَقَدْ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا لاَ إِلَهَ إِلاَّ اللَّهُ. فَمَنْ قَالَهَا فَقَدْ

عَصَمَ مِنِّي مَالَهُ وَنَفْسَهُ إِلاَّ بِحَقِّهِ، وَحِسَابُهُ عَلَى اللَّهِ». فَقَالَ: وَاللَّهِ لأُقَاتِلَنَّ مَنْ فَرَّقَ بَيْنَ الصَّلاَةِ وَالزَّكَاةِ، فَإِنَّ الزَّكَاةَ حَقُّ الْمَالِ، وَاللَّهِ لَوْ مَنَعُونِي عَنَاقًا كَانُوا يُؤَدُّونَهَا إِلَى رَسُولِ اللَّهِ ﷺ لَقَاتَلْتُهُمْ عَلَى مَنْعِهَا. قَالَ عُمَرُ ﷺ: فَوَاللَّهِ مَا هُوَ إِلاَّ أَنْ قَدْ شَرَحَ اللَّهُ صَدْرَ أَبِي بَكْرٍ ﷺ فَعَرَفْتُ أَنَّهُ الْحَقُّ. [رواه البخاري: ١٣٩٩-١٤٠٠]

**705.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbər ﷺ vəfat etdikdən və Əbu Bəkr (xəlifə) olduqdan sonra ərəblərdən bəziləri kafir oldular. Onda Ömər (Əbu Bəkrə) dedi: "Sən onlarla necə vuruşa bilərsən ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar: "lə ilahə illəllah" deməyincə onlarla vuruşmaq mənə əmr edildi. Bu sözü deyən hər kəs haqlı bir səbəb olmadıqca, malını və canını məndən qorumuş olar. (Qəlbindəkilərinin) hesabı isə Allaha aiddir." Əbu Bəkr dedi: "Vallahi, mən, namazı zəkatdan ayıran (namaz qılıb zəkat verməkistəməyən) hər kəslə vuruşacağam. Çünki zəkat malın haqqıdır. Vallahi ki, əgər onlar (vaxtilə) Allahın elçisinə ﷺ verdikləri çəpişi mənə verməkdən boyun qaçırsalar, buna görə onlarla vuruşacağam." Ömər dedi: "Vallahi, bu, Allahın Əbu Bəkrin qəlbinə saldığı (doğru fikirdən) başqa bir şey deyildi. Mən başa düşdüm ki, o, haqlıdır." (əl-Buxari, 1399-1400)

## ٢- باب: إِثْمُ مَانِعِ الزَّكَاةِ

## 2-ci fəsil. Zəkat verməyənin günahı

٧٠٦ - عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «تَأْتِي الإِبِلُ عَلَى صَاحِبِهَا، عَلَى خَيْرِ مَا كَانَتْ، إِذَا هُوَ لَمْ يُعْطِ فِيهَا حَقَّهَا، تَطَؤُهُ بِأَخْفَافِهَا، وَتَأْتِي الْغَنَمُ عَلَى صَاحِبِهَا عَلَى خَيْرِ مَا كَانَتْ، إِذَا لَمْ يُعْطِ فِيهَا حَقَّهَا، تَطَؤُهُ بِأَظْلاَفِهَا، وَتَنْطَحُهُ بِقُرُونِهَا». وَقَالَ: «وَمِنْ حَقِّهَا أَنْ تُحْلَبَ عَلَى الْمَاءِ». قَالَ: «وَلاَ يَأْتِي أَحَدُكُمْ يَوْمَ الْقِيَامَةِ بِشَاةٍ يَحْمِلُهَا عَلَى رَقَبَتِهِ لَهَا يُعَارٌ، فَيَقُولُ يَا مُحَمَّدُ. فَأَقُولُ لاَ أَمْلِكُ لَكَ شَيْئًا قَدْ بَلَّغْتُ. وَلاَ يَأْتِي بِبَعِيرٍ، يَحْمِلُهُ عَلَى رَقَبَتِهِ لَهُ رُغَاءٌ، فَيَقُولُ يَا مُحَمَّدُ. فَأَقُولُ لاَ أَمْلِكُ لَكَ شَيْئًا قَدْ بَلَّغْتُ». [رواه البخاري: ١٤٠٢]

**706.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Qiyamət günü) dəvələr öz sahibinin yanına (dünyada) olduğundan daha gözəl görkəmdə gələcək. Əgər sahibi onlardan zəkat verməmişdirsə, onu ayaqlarının altına alıb tapdalayacaqlar. Həmçinin qoyunlar da öz sahibinin yanına (dünyada) olduğundan daha gözəl görkəmdə gələcək. Əgər sahibi onlardan zəkat verməmişdirsə, dırnaqları ilə onu tapdalayacaq və buynuzları ilə onu buynuzlayacaqlar.

Bu heyvanların üzərindəki haqlardan biri də suvarıldıqları yerdə südünü sağmaq (və fağır-füqəraya verməkdir).

Sizlərdən (qoyunlarının zəkatını) verməyən kimsə Qiyamət günü boynunda mələyən bir qoyunla gəlib deməsin: "(Kömək et,) ey Muhəmməd!" Çünki mən deyəcəyəm: "Sənə heç bir şeylə kömək edə bilmərəm. Mən (Allahın hökmünü sənə) təbliğ etmişdim." Habelə boynunda nərildəyən bir dəvə ilə gəlib deməsin: "(Yardım et,) ey Muhəmməd!" Çünki mən deyəcəyəm: "Sənə heç bir şeylə yardım edə bilmərəm. Mən (Allahın hökmünü sənə) təbliğ etmişdim." (əl-Buxari, 1402)

٧٠٧ - عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ آتَاهُ اللَّهُ مَالاً، فَلَمْ يُؤَدِّ زَكَاتَهُ مُثِّلَ لَهُ يَوْمَ الْقِيَامَةِ شُجَاعًا أَقْرَعَ، لَهُ زَبِيبَتَانِ، يُطَوَّقُهُ يَوْمَ الْقِيَامَةِ، ثُمَّ يَأْخُذُ بِلِهْزِمَتَيْهِ - يَعْنِي شِدْقَيْهِ - ثُمَّ يَقُولُ أَنَا مَالُكَ، أَنَا كَنْزُكَ» ثُمَّ تَلاَ: ﴿وَلَا يَحْسَبَنَّ ٱلَّذِينَ يَبْخَلُونَ﴾ الآيَةَ. [رواه البخاري: ١٤٠٣]

**707.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim Allahın ona bəxş etdiyi var-dövlətin zəkatını vermirsə, Qiyamət günü o var-dövlət başının tükü tökülmüş[1], gözlərinin də üstündə iki qara xalı olan ilana çevrilib onun boynuna sarılacaq və ağzının hər iki tərəfindən yapışıb deyəcək: “Mən sənin var-dövlətinəm! Mən sənin xəzinənəm!” Sonra Peyğəmbər ﷺ bu ayəni oxudu: “Allahın Öz lütfündən bəxş etdiyini xərcləməyə xəsislik edənlər elə güman etməsinlər ki, bu, onların xeyrinədir. Əksinə, bu, onlar üçün pisdir. Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına dolanacaqdır. Göylərin və yerin mirası Allaha məxsusdur. Allah nə etdiklərinizdən xəbərdardır.”[2] (əl-Buxari, 1403)

## 3-cü fəsil. Zəkatı verilmiş mal xəzinə sayılmır

## ٣- باب: مَا أُدِّىَ زَكَاتُهُ فَلَيْسَ بِكَنْزٍ

٧٠٨ – عَنْ أَبِي سَعِيدٍ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «لَيْسَ فِيمَا دُونَ خَمْسِ أَوَاقٍ صَدَقَةٌ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسِ ذَوْدٍ صَدَقَةٌ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسِ أَوْسُقٍ صَدَقَةٌ». [رواه البخاري: ١٤٠٥]

**708.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Beş övqiyədən[3] az (gümüşdən) zəkat vermək gərək deyil. Beş dəvədən az sayda olan sürüdən zəkat vermək gərək deyil. Beş vəsqdən[4] az məhsuldan zəkat vermək gərək deyil.” (əl-Buxari, 1405)

## 4-cü fəsil. Sədəqə halal qazancdan verilməlidir

## ٤- باب: الصَّدَقَةُ مِنْ كَسْبٍ طَيِّبٍ

٧٠٩ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ تَصَدَّقَ بِعَدْلِ تَمْرَةٍ مِنْ كَسْبٍ طَيِّبٍ – وَلاَ يَقْبَلُ اللَّهُ إِلاَّ الطَّيِّبَ – وَإِنَّ اللَّهَ يَتَقَبَّلُهَا بِيَمِينِهِ، ثُمَّ يُرَبِّيهَا لِصَاحِبِهِ كَمَا يُرَبِّى أَحَدُكُمْ فَلُوَّهُ حَتَّى تَكُونَ مِثْلَ الْجَبَلِ». [رواه البخاري: ١٤١٠]

**709.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim halal (yolla qazandığı) maldan sədəqə verərsə, – Allah ancaq halal olanı qəbul edir, – Allah bu sədəqəni sağ Əli ilə qəbul edər, sonra da onu sahibi üçün, biriniz öz dayçasını bəsləyib böyütdüyü kimi, dağ boyda olanadək böyüdər.” (əl-Buxari, 1410)

## 5-ci fəsil. Sədəqə qəbul olunanadək onu vermək gərəkdir

## ٥- باب: الصَّدَقَةُ قَبْلَ الرَّدِّ

٧١٠ – عَنْ حَارِثَةَ بْنِ وَهْبٍ رضي الله عنه قَالَ سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: تَصَدَّقُوا فَإِنَّهُ يَأْتِي عَلَيْكُمْ زَمَانٌ يَمْشِي الرَّجُلُ بِصَدَقَتِهِ، فَلاَ يَجِدُ مَنْ يَقْبَلُهَا يَقُولُ الرَّجُلُ لَوْ جِئْتَ بِهَا بِالأَمْسِ لَقَبِلْتُهَا، فَأَمَّا الْيَوْمَ فَلاَ حَاجَةَ لِي بِهَا. [رواه البخاري: ١٤١١]

---

[1] Bu ifadə ilanın həddən artıq zəhərli olduğuna işarədir.

[2] “Ali-İmran” surəsi, 180.

[3] Bir övqiyə 40 dirhəmə bərabərdir. Deməк, 5 övqiyə 200 dirhəmə bərabərdir. O dövrün 1 dirhəmi 0,7 misqala, 200 dirhəmi 140 misqala – bu da 595 qram gümüşə bərabərdir. Qızıla gəlincə, onun miqdarı iyirmi dinar və bundan artıq olduqda onun qırxda bir hissəsi və ya 2,5 % zəkat verilməlidir. O dövrün 1 dinarı 4,25 misqala, 20 dinarı 85 qram gızıla bərabərdir. (“Şərh Zadul-Müstəğna”, 6/103-104)

[4] Bir vəsq 60 saaya, bir saa isə 2,40 kiloqrama buğdaya bərabərdir. (“Şərh Zadul-Müstəğna”, 6/104) Demək, 5 vəsq 300 saaya, bu da 720 kiloqrama buğdaya bərabərdir.

**710.** Rəvayət edilir ki, Harisə ibn Vəhb ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Sədəqə verin! Həqiqətən, elə bir zaman gələcək ki, adam əlində olan sədəqə ilə gəzib-dolaşacaq, amma onu verməyə bir adam tapa bilməyəcək. (Adam tapıb sədəqəni ona vermək istədikdə isə həmin) adam deyəcək: "Dünən gətirsəydin götürərdim, bu gün isə mənim buna ehtiyacım yoxdur." (əl-Buxari, 1411)

**٧١١** – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «لاَ تَقُومُ السَّاعَةُ حَتَّى يَكْثُرَ فِيكُمُ الْمَالُ فَيَفِيضَ، حَتَّى يُهِمَّ رَبَّ الْمَالِ مَنْ يَقْبَلُ صَدَقَتَهُ، وَحَتَّى يَعْرِضَهُ فَيَقُولَ الَّذِى يَعْرِضُهُ عَلَيْهِ لاَ أَرَبَ لِى». [رواه البخاري: ١٤١٢]

**711.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizin var-dövlətiniz çoxalıb başınızdan aşıb-daşmayınca Qiyamət qopmayacaq. İş o yerə gəlib çatacaq ki, mal sahibi işini-gücünü buraxıb sədəqəsini qəbul edəcək adam axtaracaq. Haçandan-haçana (belə bir adam tapıb) sədəqəni ona təklif etdikdə, həmin adam: "Ehtiyacım yoxdur"- deyəcək." (əl-Buxari, 1412)

**٧١٢** – عَنْ عَدِىِّ بْنِ حَاتِمٍ ﵁ قَالَ: كُنْتُ عِنْدَ رَسُولِ اللَّهِ ﷺ فَجَاءَهُ رَجُلاَنِ أَحَدُهُمَا يَشْكُو الْعَيْلَةَ، وَالآخَرُ يَشْكُو قَطْعَ السَّبِيلِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَمَّا قَطْعُ السَّبِيلِ فَإِنَّهُ لاَ يَأْتِى عَلَيْكَ إِلاَّ قَلِيلٌ حَتَّى تَخْرُجَ الْعِيرُ إِلَى مَكَّةَ بِغَيْرِ خَفِيرٍ، وَأَمَّا الْعَيْلَةُ فَإِنَّ السَّاعَةَ لاَ تَقُومُ حَتَّى يَطُوفَ أَحَدُكُمْ بِصَدَقَتِهِ لاَ يَجِدُ مَنْ يَقْبَلُهَا مِنْهُ، ثُمَّ لَيَقِفَنَّ أَحَدُكُمْ بَيْنَ يَدَىِ اللَّهِ لَيْسَ بَيْنَهُ وَبَيْنَهُ حِجَابٌ وَلاَ تُرْجُمَانٌ يُتَرْجِمُ لَهُ، ثُمَّ لَيَقُولَنَّ لَهُ أَلَمْ أُوتِكَ مَالاً فَلَيَقُولَنَّ بَلَى. ثُمَّ لَيَقُولَنَّ أَلَمْ أُرْسِلْ إِلَيْكَ رَسُولاً فَلَيَقُولَنَّ بَلَى. فَيَنْظُرُ عَنْ يَمِينِهِ فَلاَ يَرَى إِلاَّ النَّارَ، ثُمَّ يَنْظُرُ عَنْ شِمَالِهِ فَلاَ يَرَى إِلاَّ النَّارَ، فَلْيَتَّقِيَنَّ أَحَدُكُمُ النَّارَ وَلَوْ بِشِقِّ تَمْرَةٍ، فَإِنْ لَمْ يَجِدْ فَبِكَلِمَةٍ طَيِّبَةٍ». [رواه البخاري: ١٤١٣]

**712.** Rəvayət edilir ki, Adiy ibn Hatim ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ yanında ikən iki nəfər şikayətə gəldi. Onlardan biri kasıbçılıqdan, digəri isə yol kəsən quldurlardan şikayət etdi. Peyğəmbər ﷺ (onları dinlədikdən sonra) dedi: "Yol kəsən quldurlara gəlincə, az bir zaman keçdikdən sonra karvanlar yanlarında heç bir mühafizəçi aparmadan Məkkəyə yollanacaqlar. Kasıbçılığa gəldikdə isə, (bilin ki,) biriniz əlindəki sədəqə ilə gəzib-dolaşıb bunu ondan qəbul edəcək bir adam tapa bilməyəcəyi vaxt gəlməyincə Qiyamət qopmayacaq. Sonra siz Allahın hüzurunda duracaqsınız və sızinlə Onun arasında heç bir pərdə olmayacaq. (Dediklərinizi) tərcümə edəcək bir tərcüməçiniz belə olmayacaq. Sonra Allah Öz qulundan soruşacaq: "Mən sənə mal-dövlət verməmişdimmi?" O: "Vermişdin"– deyəcək. Sonra soruşacaq: "Mən sənə peyğəmbər göndərməmişdimmi?" O: "Göndərmişdin"– deyəcək. Bundan sonra o, əvvəlcə sağına, sonra da soluna baxacaq, lakin oddan başqa bir şey görməyəcək. Elə isə heç olmasa, yarım xurma (sədəqə) ilə özünüzü Oddan qoruyun. Bunu tapmasanız, onda gözəl söz danışmaqla (özünüzü Oddan qoruyun)." (əl-Buxari, 1413)

**٧١٣** – عَنْ أَبِى مُوسَى ﵁ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لَيَأْتِيَنَّ عَلَى النَّاسِ زَمَانٌ يَطُوفُ الرَّجُلُ فِيهِ بِالصَّدَقَةِ مِنَ الذَّهَبِ ثُمَّ لاَ يَجِدُ أَحَدًا يَأْخُذُهَا مِنْهُ، وَيُرَى الرَّجُلُ الْوَاحِدُ يَتْبَعُهُ أَرْبَعُونَ امْرَأَةً، يَلُذْنَ بِهِ مِنْ قِلَّةِ الرِّجَالِ وَكَثْرَةِ النِّسَاءِ».
[رواه البخاري: ١٤١٤]

**713.** Əbu Musa ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlara elə bir zaman gələcək ki, adam əlindəki qızıl sədəqəni vermək üçün gəzib-dolaşacaq, lakin

bunu ondan götürəcək bir adam tapa bilməyəcək. Həmin vaxt kişilərin sayı az, qadınların sayı isə çox olduğundan qırx qadının bir kişinin dalınca düşüb onun himayəsi altına girmək istədiyini görmək olacaq." (əl-Buxari, 1414)

## 6-cı fəsil. Yarım xurma və ya bir qədər sədəqə verməklə özünüzü Cəhənnəmdən qoruyun

## ٦- باب: اتَّقُوا النَّارَ وَلَوْ بِشِقِّ تَمْرَةٍ، وَالْقَلِيلِ مِنَ الصَّدَقَةِ

٧١٤ – عَنْ أَبِي مَسْعُودٍ الأَنْصَارِيِّ ﷺ قَالَ كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا أَمَرَنَا بِالصَّدَقَةِ انْطَلَقَ أَحَدُنَا إِلَى السُّوقِ فَتَحَامَلَ فَيُصِيبُ الْمُدَّ، وَإِنَّ لِبَعْضِهِمُ الْيَوْمَ لَمِائَةَ أَلْفٍ. [رواه البخاري: ١٤١٦]

**714.** Rəvayət edilir ki, Əbu Məsud əl-Ənsari ﷺ demişdir: "Peyğəmbər ﷺ bizə sədəqə verməyi əmr etdiyi zaman aramızdan bəziləri gedib bazarda yük daşıyar və (bunun müqabilində) bir ovuc (ərzaq) alar (onu da fağır-füqəraya verərdi). Bu gün onların bəzisinin yüz mini vardır." (əl-Buxari, 1416)

٧١٥ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ دَخَلَت امْرَأَةٌ مَعَهَا ابْنَتَانِ لَهَا تَسْأَلُ، فَلَمْ تَجِدْ عِنْدِي شَيْئًا غَيْرَ تَمْرَةٍ فَأَعْطَيْتُهَا إِيَّاهَا، فَقَسَمَتْهَا بَيْنَ ابْنَتَيْهَا وَلَمْ تَأْكُلْ مِنْهَا، ثُمَّ قَامَتْ فَخَرَجَتْ، فَدَخَلَ النَّبِيُّ ﷺ عَلَيْنَا، فَأَخْبَرْتُهُ فَقَالَ: «مَنِ ابْتُلِيَ مِنْ هَذِهِ الْبَنَاتِ بِشَيْءٍ كُنَّ لَهُ سِتْرًا مِنَ النَّارِ». [رواه البخاري: ١٤١٨]

**715.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Bir qadın iki qızı ilə birlikdə yanıma gəlib (yeməyə bir şey) istədi. Məndə bircə dənə xurma var idi. Mən xurmanı ona verdim, o da onu iki yerə bölüb qızların hər birinə bir yarısını verdi, özü isə ondan yemədi. Qadın durub getdikdən sonra Peyğəmbər ﷺ bizim yanımıza daxil oldu. Mən (baş verənləri) ona xəbər verdikdə o buyurdu: "Kim qız uşaqları ilə sınağa çəkilsə (onların qayğısına qalsa və onlara gözəl tərbiyə versə), bu qızlar (onunla) Cəhənnəm odu arasında onu qoruyan bir sipər olar." (əl-Buxari, 1418)

## 7-ci fəsil. Hansı sədəqə ən yaxşı (sədəqə sayılır)?

## ٧- باب: أَيُّ الصَّدَقَةِ أَفْضَلُ؟

٧١٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: جَاءَ رَجُلٌ إِلَى النَّبِيِّ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ أَيُّ الصَّدَقَةِ أَعْظَمُ أَجْرًا قَالَ: «أَنْ تَصَدَّقَ وَأَنْتَ صَحِيحٌ شَحِيحٌ، تَخْشَى الْفَقْرَ وَتَأْمُلُ الْغِنَى، وَلاَ تُمْهِلُ حَتَّى إِذَا بَلَغَتِ الْحُلْقُومَ قُلْتَ لِفُلاَنٍ كَذَا، وَلِفُلاَنٍ كَذَا، وَقَدْ كَانَ لِفُلاَنٍ». [رواه البخاري: ١٤١٩]

**716.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, savabı ən böyük olan sədəqə hansıdır?" Peyğəmbər ﷺ buyurdu: "Bu, sənin sağlam və xəsis olduğun, kasıb olmaqdan ehtiyat etdiyin və varlanacağına ümid bəslədiyin halda verdiyin sədəqədir. Bir də ki, sədəqə verməyi, canın boğazına yetişən vaxta, özün də "filankəsə bu qədər, filankəsə də bu qədər (verin)" (deyə vəsiyyət edəcəyin günə) saxlama. (Çünki) həmin vaxt (mal-dövlətin) başqalarına (miras) qalacaq." (əl-Buxari, 1419)

## 8-ci fəsil.

## ٨– باب

٧١٧ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ بَعْضَ أَزْوَاجِ النَّبِيِّ ﷺ قُلْنَ لِلنَّبِيِّ ﷺ أَيُّنَا أَسْرَعُ بِكَ لُحُوقًا قَالَ: «أَطْوَلُكُنَّ يَدًا». فَأَخَذُوا قَصَبَةً يَذْرَعُونَهَا، فَكَانَتْ سَوْدَةُ أَطْوَلَهُنَّ يَدًا، فَعَلِمْنَا بَعْدُ أَنَّمَا كَانَتْ طُولَ يَدِهَا الصَّدَقَةُ، وَكَانَتْ أَسْرَعَنَا لُحُوقًا بِهِ وَكَانَتْ تُحِبُّ الصَّدَقَةَ. [رواه البخاري: ١٤٢٠]

**717.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbərin ﷺ zövcələrindən bəzisi Peyğəmbərdən ﷺ: "Hansımız sənə daha tez qovuşacaq?"– deyə soruşdular. O: "Əli ən uzun olanınız"– deyə cavab verdi. (Belə deyəndə) onlar bir qamış götürüb qollarını ölçməyə başladılar. Ən uzun qollu Səudə idi. (Zeynəb bint Cəhş vəfat etdikdə[1]) biz başa düşdük ki, uzun əl deyildikdə, sədəqə (vermək) qəsd edilirdi. O, hamımızdan tez Peyğəmbərə ﷺ qovuşdu. (Həqiqətən,) o, sədəqə verməyi sevirdi." (əl-Buxari, 1420)

## 9-cu fəsil. Varlı adamın varlı olduğunu bilmədən ona sədəqə vermək

## ٩– باب: إِذَا تَصَدَّقَ عَلَى غَنِيٍّ وَهُوَ لاَ يَعْلَم

٧١٨ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «قَالَ رَجُلٌ لأَتَصَدَّقَنَّ بِصَدَقَةٍ. فَخَرَجَ بِصَدَقَتِهِ فَوَضَعَهَا فِي يَدِ سَارِقٍ فَأَصْبَحُوا يَتَحَدَّثُونَ تُصُدِّقَ عَلَى سَارِقٍ. فَقَالَ اللَّهُمَّ لَكَ الْحَمْدُ لأَتَصَدَّقَنَّ بِصَدَقَةٍ. فَخَرَجَ بِصَدَقَتِهِ فَوَضَعَهَا فِي يَدَيْ زَانِيَةٍ، فَأَصْبَحُوا يَتَحَدَّثُونَ تُصُدِّقَ اللَّيْلَةَ عَلَى زَانِيَةٍ. فَقَالَ اللَّهُمَّ لَكَ الْحَمْدُ عَلَى زَانِيَةٍ، لأَتَصَدَّقَنَّ بِصَدَقَةٍ. فَخَرَجَ بِصَدَقَتِهِ فَوَضَعَهَا فِي يَدَيْ غَنِيٍّ فَأَصْبَحُوا يَتَحَدَّثُونَ تُصُدِّقَ عَلَى غَنِيٍّ فَقَالَ اللَّهُمَّ لَكَ الْحَمْدُ، عَلَى سَارِقٍ وَعَلَى زَانِيَةٍ وَعَلَى غَنِيٍّ. فَأُتِيَ فَقِيلَ لَهُ أَمَّا صَدَقَتُكَ عَلَى سَارِقٍ فَلَعَلَّهُ أَنْ يَسْتَعِفَّ عَنْ سَرِقَتِهِ، وَأَمَّا الزَّانِيَةُ فَلَعَلَّهَا أَنْ تَسْتَعِفَّ عَنْ زِنَاهَا، وَأَمَّا الْغَنِيُّ فَلَعَلَّهُ يَعْتَبِرُ فَيُنْفِقُ مِمَّا أَعْطَاهُ اللَّهُ». [رواه البخاري: ١٤٢١]

**718.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir nəfər: "Mən mütləq sədəqə verəcəyəm"– dedi, sonra da (verəcəyi) sədəqəni götürüb (evdən) çıxdı və (özü də bilmədən) onu bir oğruya verdi. Səhər açıldıqda insanlar: "Oğruya sədəqə verilmişdir"– deyə danışmağa başladılar. Bu adam: "Allahım, həmd Sənə məxsusdur! Mən yenə sədəqə verəcəyəm"– dedi, sonra verəcəyi sədəqəni götürüb (evdən) çıxdı və (bilmədən) onu zinakar bir qadına verdi. Səhər açıldıqda insanlar: "Bu gecə zinakar qadına sədəqə verilmişdir"– deyə danışmağa başladılar. Adam: "Allahım, həmd Sənə məxsusdur! (Verdiyim sədəqə) zinakar qadına çatdı. Mən yenə sədəqə verəcəyəm"– dedi, sonra sədəqəni götürüb (evdən) çıxdı və (bilmədən) onu varlı bir adama verdi. Səhər açıldıqda insanlar: "Varlıya sədəqə verilmişdir"– deyə danışmağa başladılar. Adam dedi: "Allahım, həmd Sənə məxsusdur! (Verdiyim sədəqələr) oğruya, zinakara və varlıya qismət oldu." Bundan sonra bir nəfər onun yanına gəlib dedi: "Oğruya verdiyin sədəqəyə gəlincə, ola bilsin ki, o, (bundan ibrət alsın) və oğurluq etməkdən əl çəksin. Zinakar qadına gəldikdə isə, ola bilsin ki, o, (ibrət alıb) zinakarlığına son qoysun. O ki qaldı varlı adama, ola bilsin ki, o, (bundan) ibrət alsın və Allahın ona verdiyi nemətlərdən (Onun yolunda) xərcləsin." (əl-Buxari, 1421)

[1] Zeynəb bint Cəhş رضي الله عنها hicrətin 20-ci ilində Ömər ibn Xəttabın رضي الله عنه xilafəti dövründə vəfat etmişdir.

## 10-cu fəsil. (Adam) bilmədən öz oğluna sədəqə verərsə

## ١٠– باب: إِذَا تَصَدَّقَ عَلَى ابْنِهِ وَهُوَ لاَ يَشْعُرُ

٧١٩ – عَنْ مَعْنِ بْنِ يَزِيدَ ﷺ قَالَ: بَايَعْتُ رَسُولَ اللَّهِ ﷺ أَنَا وَأَبِى وَجَدِّى وَخَطَبَ عَلَىَّ فَأَنْكَحَنِى وَخَاصَمْتُ إِلَيْهِ، كَانَ أَبِى يَزِيدُ أَخْرَجَ دَنَانِيرَ يَتَصَدَّقُ بِهَا فَوَضَعَهَا عِنْدَ رَجُلٍ فِى الْمَسْجِدِ، فَجِئْتُ فَأَخَذْتُهَا فَأَتَيْتُهُ بِهَا فَقَالَ وَاللَّهِ مَا إِيَّاكَ أَرَدْتُ. فَخَاصَمْتُهُ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: «لَكَ مَا نَوَيْتَ يَا يَزِيدُ، وَلَكَ مَا أَخَذْتَ يَا مَعْنُ». [رواه البخاري: ١٤٢٢]

**719.** Rəvayət edilir ki, Mə'n ibn Yezid ﷺ demişdir: "Mən, atam və babam Peyğəmbərə ﷺ beyət etdik. (Peyğəmbər ﷺ) mənim elçiliyimi edib məni evləndirdi. (Bir dəfə) mən (mübahisəli) bir məsələ ilə bağlı Peyğəmbərə ﷺ müraciət etdim. Atam Yezid sədəqə vermək üçün bir neçə dinar çıxardıb məsciddə olan bir nəfərin yanına qoymuşdu (ki, onu ehtiyacı olanlara versin). Mən (ora) gəldikdə (həmin adam sədəqəni mənə verdi), mən də o pulu götürüb atamın yanına gəldim. Atam dedi: "Vallahi, mən (bunu) sənin üçün qoymamışdım." Mən bunun hökmünü Peyğəmbərdən ﷺ soruşduqda o buyurdu: "Sənə niyyət etdiyinin (savabı çatır), ey Yezid. Sənə də götürdüyün (çatır), ey Mə'n!" (əl-Buxari, 1422)

## 11-ci fəsil. Özü (sədəqə) verməyib, xidmətçisinə sədəqə verməyi tapşıran kimsə

## ١١– باب: مَنْ أَمَرَ خَادِمَهُ بِالصَّدَقَةِ وَلَمْ يُنَاوِلْ بِنَفْسِهِ

٧٢٠ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِذَا أَنْفَقَتِ الْمَرْأَةُ مِنْ طَعَامِ بَيْتِهَا غَيْرَ مُفْسِدَةٍ كَانَ لَهَا أَجْرُهَا بِمَا أَنْفَقَتْ وَلِزَوْجِهَا أَجْرُهُ بِمَا كَسَبَ، وَلِلْخَازِنِ مِثْلُ ذَلِكَ، لاَ يَنْقُصُ بَعْضُهُمْ أَجْرَ بَعْضٍ شَيْئًا». [رواه البخاري: ١٤٢٥]

**720.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qadın (ailə üzvlərinə) ziyan vurmadan evində olan yeməkdən sədəqə versə, verdiyinin savabını qazanar; əri də qazandığının savabını alar; həmçinin xidmətçiyə də bir o qədər savab çatar; birinin savabı digərinin savabından heç bir şey azaltmaz." (əl-Buxari, 1425)

## 12-ci fəsil. Sədəqə ancaq artıq olan maldan verilməlidir

## ١٢– باب: لاَ صَدَقَةَ إِلاَّ عَنْ ظَهْرِ غِنًى

٧٢١ – عَنْ حَكِيمِ بْنِ حِزَامٍ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «الْيَدُ الْعُلْيَا خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى، وَابْدَأْ بِمَنْ تَعُولُ، وَخَيْرُ الصَّدَقَةِ عَنْ ظَهْرِ غِنًى، وَمَنْ يَسْتَعْفِفْ يُعِفَّهُ اللَّهُ، وَمَنْ يَسْتَغْنِ يُغْنِهِ اللَّهُ». [رواه البخاري: ١٤٢٧]

**721.** Həkim ibn Hizam ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Verən əl alan əldən daha xeyirlidir. Baxmağın vacib olan kimsələrdən[1] başla. Ən xeyirli sədəqə, zəngin ikən verilən (sədəqədir). İffətli olmaq istəyəni Allah iffətli edər.

[1] Burada insanın özü, ata-anası və digər ailə üzvləri nəzərdə tutulur.

(İnsanlara) möhtac olmaq istəməyən kimsəni Allah heç kəsə möhtac etməz." (əl-Buxari, 1427)

٧٢٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ وَهُوَ عَلَى الْمِنْبَرِ، وَذَكَرَ الصَّدَقَةَ وَالتَّعَفُّفَ وَالْمَسْأَلَةَ: «الْيَدُ الْعُلْيَا خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى، فَالْيَدُ الْعُلْيَا هِيَ الْمُنْفِقَةُ، وَالسُّفْلَى هِيَ السَّائِلَةُ». [رواه البخاري: ١٤٢٩]

**722.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ minbərdə ikən sədəqə vermək, iffətli olmaq və dilənmək haqqında belə demişdir: "Uca əl alçaq əldən daha xeyirlidir. Uca əl (sədəqə) verən əldir; alçaq əl isə dilənən əldir." (əl-Buxari, 1429)

### ١٣ – باب: التَّحْرِيضُ عَلَى الصَّدَقَةِ وَالشَّفَاعَةِ فِيهَا

### **13-cü fəsil.** (Başqalarını) **sədəqə verməyə təhrik etmək və buna görə şəfaətçilik etmək**

٧٢٣ – عَنْ أَبِي مُوسَى رضي الله عنه قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا جَاءَهُ السَّائِلُ، أَوْ طُلِبَتْ إِلَيْهِ حَاجَةٌ قَالَ: «اشْفَعُوا تُؤْجَرُوا، وَيَقْضِي اللَّهُ عَلَى لِسَانِ نَبِيِّهِ ﷺ مَا شَاءَ». [رواه البخاري: ١٤٣٢]

**723.** Rəvayət edilir ki, Əbu Musa رضي الله عنه demişdir: "Peyğəmbərin ﷺ yanına dilənçi gəldikdə və ya kimsə ondan bir şey istədikdə deyərdi: "(Ehtiyacı olanlara) kömək edin ki, savab qazanasınız. Allah dilədiyi bir şeyə Öz peyğəmbərinin ﷺ dili ilə hökm edəcəkdir." (əl-Buxari, 1432)

٧٢٤ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ رضي الله عنهما قَالَتْ: قَالَ لِي النَّبِيُّ ﷺ: «لاَ تُوكِي فَيُوكَى عَلَيْكِ». وَ فِي رِوَايَةٍ قَالَ: «وَلاَ تُحْصِي فَيُحْصِيَ اللَّهُ عَلَيْكِ» [رواه البخاري: ١٤٣٣]

**724.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ mənə: "Kisənin ağzını bağlama, yoxsa sənə qarşı da bağlanar"[1]– deyə buyurmuşdu.

Digər hədisdə rəvayət edilir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Sayma, yoxsa Allah da sənin əleyhinə sayar"[2]. (əl-Buxari, 1433)

### ١٤ – باب: الصَّدَقَةُ فِيمَا اسْتَطَاعَ

### **14-cü fəsil. Sədəqə imkan daxilində verilməlidir**

٧٢٥ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «لاَ تُوعِي فَيُوعِيَ اللَّهُ عَلَيْكِ، ارْضَخِي مَا اسْتَطَعْتِ». [رواه البخاري: ١٤٣٤]

**725.** Əsma bint Əbu Bəkr رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Gizlətmə, yoxsa Allah da (verdiyi nemətləri) səndən gizlədər. Bacardığın qədər (malından Allah yolunda) xərclə!" (əl-Buxari, 1434)

---

[1] Yəni, ehtiyacı olanlara köməklik etməkdən imtina etmə, yoxsa Allah sənə verdiyini əlindən alar, ya da ən azı onun miqdarını azaldar.

[2] Yəni, malının azalacağından ehtiyat edib xəsislik etmə, yoxsa Allah sənə verdiyi nemətlərin sayını azaldar.

## 15-ci fəsil. Müşrik ikən sədəqə verib sonra müsəlman olan kimsə

## ١٥ – باب: مَنْ تَصَدَّقَ فِى الشِّرْكِ ثُمَّ أَسْلَمَ

٧٢٦ – عَنْ حَكِيمِ بْنِ حِزَامٍ ﷺ قَالَ: قُلْتُ يَا رَسُولَ اللَّهِ أَرَأَيْتَ أَشْيَاءَ كُنْتُ أَتَحَنَّثُ بِهَا فِى الْجَاهِلِيَّةِ مِنْ صَدَقَةٍ أَوْ عَتَاقَةٍ وَصِلَةِ رَحِمٍ فَهَلْ فِيهَا مِنْ أَجْرٍ فَقَالَ النَّبِىُّ ﷺ: «أَسْلَمْتَ عَلَى مَا سَلَفَ مِنْ خَيْرٍ». [رواه البخاري: ١٤٣٦]

**726.** Rəvayət edilir ki, Həkim ibn Hizam ﷺ demişdir: "Mən soruşdum: "Ya Rəsulullah! De görüm, cahiliyyət dövründə sədəqə vermək, qul azad etmək və qohumluq əlaqələrini möhkəmləndirmək kimi gördüyüm yaxşı işlərə görə mənə savab yazılırmı?" Peyğəmbər ﷺ buyurdu: "Olub-keçən yaxşılıqlarla bərabər müsəlman oldun!" (əl-Buxari, 1436)

## 16-cı fəsil. Fəsad törətmədən ağasının əmri ilə sədəqə verən xidmətçinin savabı haqqında

## ١٦ – باب: أَجْرُ الْخَادِمِ إِذَا تَصَدَّقَ بِأَمْرِ صَاحِبِهِ غَيْرَ مُفْسِدٍ

٧٢٧ – عَنْ أَبِي مُوسَى ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «الْخَازِنُ الْمُسْلِمُ الأَمِينُ الَّذِى يُنْفِذُ – وَرُبَّمَا قَالَ يُعْطِى – مَا أُمِرَ بِهِ كَامِلاً مُوَفَّرًا طَيِّبٌ بِهِ نَفْسُهُ، فَيَدْفَعُهُ إِلَى الَّذِى أُمِرَ لَهُ بِهِ، أَحَدُ الْمُتَصَدِّقَيْنِ». [رواه البخاري: ١٤٣٨]

**727.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Özünə əmr ediləni mükəmməl şəkildə – könül xoşluğu ilə yerinə yetirib (sədəqəni) veriləcək adama çatdıran, (başqasının malını) qoruyan etibarlı müsəlman sədəqə verən iki nəfərdən biri hesab olunur (sədəqəni verən adam qədər savab qazanır)." (əl-Buxari, 1438)

## 17-ci fəsil. Allahın: "Kim (haqqı olanın haqqını) verir və *Allahdan* qorxursa..." sözü[1] və (mələyin): "Allahım, malından (Sənin yolunda) xərcləyən kimsəyə əvəzini ver!" sözü

## ١٧ – باب: قَوْلُ اللَّهِ تَعَالَى ﴿فَأَمَّا مَنْ أَعْطَىٰ وَاتَّقَىٰ﴾ اللَّهُمَّ أَعْطِ مُنْفِقَ مَالٍ خَلَفًا

٧٢٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «مَا مِنْ يَوْمٍ يُصْبِحُ الْعِبَادُ فِيهِ إِلاَّ مَلَكَانِ يَنْزِلاَنِ فَيَقُولُ أَحَدُهُمَا اللَّهُمَّ أَعْطِ مُنْفِقًا خَلَفًا، وَيَقُولُ الآخَرُ اللَّهُمَّ أَعْطِ مُمْسِكًا تَلَفًا». [رواه البخاري: ١٤٤٢]

**728.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər səhər insanlar yuxudan oyandıqda, yer üzünə iki mələk enir. Onlardan biri: "Allahım, malını (Sənin yolunda) xərcləyən hər kəsə (etdiyi yaxşılığın) əvəzini ver!"– deyir. Digəri isə: "Allahım, xəsislik edən hər kəsi tələf et!"– deyir." (əl-Buxari, 1442)

---

[1] "əl-Leyl" surəsi, 5.

## ١٨– باب: مَثَلُ الْمُتَصَدِّقِ وَالْبَخِيلِ

## 18-ci fəsil. Sədəqə verənlə xəsisin məsəli

٧٢٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّه ﷺ يَقُولُ: «مَثَلُ الْبَخِيلِ وَالْمُنْفِق كَمَثَلِ رَجُلَيْنِ، عَلَيْهِمَا جُبَّتَانِ مِنْ حَدِيد، مِنْ ثُدِيِّهِمَا إِلَى تَرَاقِيهِمَا، فَأَمَّا الْمُنْفِقُ فَلاَ يُنْفِقُ إِلاَّ سَبَغَتْ – أَوْ وَفَرَتْ – عَلَى جِلْده حَتَّى تُخْفِيَ بَنَانَهُ وَتَعْفُوَ أَثَرَهُ، وَأَمَّا الْبَخِيلُ فَلاَ يُرِيدُ أَنْ يُنْفِقَ شَيْئًا إِلاَّ لَزِقَتْ كُلُّ حَلْقَة مَكَانَهَا، فَهُوَ يُوَسِّعُهَا وَلاَ تَتَّسِعُ». [رواه البخاري: ١٤٤٣]

**729.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Xəsislə əliaçıq adamın məsəli, əyninə, (bədəninin) sinədən körpücük sümüklərinə qədər olan hissəsini örtən, dəmir cübbə geymiş iki adamın məsəlinə bənzəyir. Əliaçıq adama gəlincə, o, (hər dəfə öz malından) xərclədikdə (cübbəsi) genişlənir, yaxud böyüyür və (bu genişlənmə) cübbəsi ta onun barmaqlarının üstünü örtənə qədər və ayaq izlərini silənədək[1] (beləcə böyüyüb genişlənir). Xəsislik edənə gəldikdə isə, o, (hər dəfə malından) xərcləmək istədikdə (cübbənin) dəmir həlqəsi yerinə yapışır və o, cübbəsini genişləndirməyə çalışsa da, cübbə genişlənmir ki, genişlənmir." (əl-Buxari, 1443)

## ١٩– باب: عَلَى كُلِّ مُسْلِم صَدَقَةٌ، فَمَنْ لَمْ يَجِدْ فَلْيَعْمَلْ بِالْمَعْرُوفِ

## 19-cu fəsil. Hər bir müsəlman sədəqə verməlidir, bunu bacarmayan kimsə yaxşı iş görməlidir

٧٣٠ – عَنْ أَبِي مُوسَى ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «عَلَى كُلِّ مُسْلِم صَدَقَةٌ». فَقَالُوا يَا نَبِيَّ اللَّه فَمَنْ لَمْ يَجِدْ قَالَ: «يَعْمَلُ بِيَده فَيَنْفَعُ نَفْسَهُ وَيَتَصَدَّقُ». قَالُوا فَإِنْ لَمْ يَجِدْ قَالَ: «يُعِينُ ذَا الْحَاجَةِ الْمَلْهُوفَ». قَالُوا فَإِنْ لَمْ يَجِدْ. قَالَ: «فَلْيَعْمَلْ بِالْمَعْرُوفِ، وَلْيُمْسِكْ عَنِ الشَّرِّ فَإِنَّهَا لَهُ صَدَقَةٌ». [رواه البخاري: ١٤٤٥]

**730.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurdu: "Hər bir müsəlman sədəqə verməlidir." (Əshabələr) soruşdular: "Ey Allahın peyğəmbəri! (Sədəqə verməyə bir şey) tapmasa necə?" (Peyğəmbər ﷺ) buyurdu: "Öz əlləri ilə işləyib qazansın və (bu qazancından) həm özü faydalansın, həm də (başqalarına) sədəqə versin." (Əshabələr) soruşdular: "(Bunu) edə bilməsə necə?" (Peyğəmbər ﷺ) buyurdu: "Ehtiyacı olan çarəsiz adama kömək etsin." (Əshabələr) soruşdular: "(Bunu da) edə bilməsə necə?" (Peyğəmbər ﷺ) buyurdu: "Yaxşı işlər görsün və şər əməllərdən çəkinsin. Həqiqətən də, bu onun üçün sədəqə olar." (əl-Buxari, 1445)

## ٢٠– باب: قَدْرُ كَمْ يُعْطَى مِنَ الزَّكَاةِ وَالصَّدَقَةِ وَمَنْ أَعْطَى شَاةً

## 20-ci fəsil. Zəkatın və sədəqənin miqdarı və sədəqə olaraq bir qoç vermək

٧٣١ – عَنْ أُمِّ عَطِيَّةَ ﷺ قَالَتْ بُعثَ إِلَى نُسَيْبَةَ الأَنْصَارِيَّةِ بِشَاة فَأَرْسَلَتْ إِلَى عَائِشَةَ ﷺ مِنْهَا فَقَالَ النَّبِيُّ ﷺ: «عِنْدَكُمْ شَيْءٌ». فَقُلْتُ لاَ إِلاَّ مَا أَرْسَلَتْ بِهِ نُسَيْبَةُ مِنْ تِلْكَ الشَّاةِ فَقَالَ: «هَاتِ فَقَدْ بَلَغَتْ مَحِلَّهَا». [رواه البخاري: ١٤٤٦]

[1] Burada cübbənin ətəyinin yerlə sürünməsi və sahibinin günahlarını ört-basdır etməsi nəzərdə tutulur.

**731.** Rəvayət edilir ki, Ummu Ətiyyə ﵄ demişdir: “(Bir dəfə) Nüseybə əl-Ənsariyyaya bir qoç (sədəqə) verdilər və o, bu qoçdan bir pay Aişəyə göndərdi. Peyğəmbər ﷺ (Aişənin yanına gəldikdə ondan): “(Yeməyə) bir şeyiniz varmı?”– deyə soruşdu. (Aişə): “Nüseybənin göndərdiyi qoç ətindən başqa bir şey yoxdur”– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: “Gətir (yeyək), çünki artıq o, öz yerinə çatmışdır.[1]” (əl-Buxari, 1446)

## **21-ci fəsil.** (Puldan deyil) **maldan zəkat vermək**

## ٢١– باب: الْعَرْضُ فِى الزَّكَاةِ

**٧٣٢ –** عَنْ أَنَسٍ ﷺ أَنَّ أَبَا بَكْرٍ ﷺ كَتَبَ لَهُ الَّتِى أَمَرَ اللَّهُ رَسُولَهُ ﷺ: «وَمَنْ بَلَغَتْ صَدَقَتُهُ بِنْتَ مَخَاضٍ وَلَيْسَتْ عِنْدَهُ وَعِنْدَهُ بِنْتُ لَبُونٍ فَإِنَّهَا تُقْبَلُ مِنْهُ، وَيُعْطِيهِ الْمُصَدِّقُ عِشْرِينَ دِرْهَمًا أَوْ شَاتَيْنِ، فَإِنْ لَمْ يَكُنْ عِنْدَهُ بِنْتُ مَخَاضٍ عَلَى وَجْهِهَا، وَعِنْدَهُ ابْنُ لَبُونٍ فَإِنَّهُ يُقْبَلُ مِنْهُ وَلَيْسَ مَعَهُ شَىْءٌ». [رواه البخاري: ١٤٤٨]

**732.** Ənəs ﷺ rəvayət edir ki, Əbu Bəkr ﷺ ona (məktub) yazıb Allahın Öz elçisinə ﷺ (zəkatla bağlı) əmr etdiklərini bildirmişdir. (Məktubda deyilirdi:) “Birillik dişi dəvəni verməyə mükəlləf olan kimsənin belə bir dəvəsi yoxdursa, lakin ikiillik dişi dəvəsi varsa, bu dəvə (zəkat olaraq) ondan qəbul edilməlidir. Fəqət zəkat yığan adam ona iyirmi dirhəm (gümüş pul) və ya iki qoç verməlidir. Əgər (zəkat verən) adamın birillik dişi dəvəsi yox, ancaq ikiillik erkək dəvəsi varsa, bu ondan qəbul edilməli və ona heç bir şey verilməməlidir.” (əl-Buxari, 1448)

## **22-ci fəsil. Zəkat verilməsi vacib olan cəm olunmuş malı ayırmaq, ayrı-ayrı olan malı da cəm etmək olmaz**

## ٢٢– باب: لاَ يُجْمَعُ بَيْنَ مُتَفَرِّقٍ وَلاَ يُفَرَّقُ بَيْنَ مُجْتَمِعٍ

**٧٣٣ –** عَنْ أَنَسٍ ﷺ أَنَّ أَبَا بَكْرٍ ﷺ كَتَبَ لَهُ الَّتِى فَرَضَ رَسُولُ اللَّهِ ﷺ: «وَلاَ يُجْمَعُ بَيْنَ مُتَفَرِّقٍ، وَلاَ يُفَرَّقُ بَيْنَ مُجْتَمِعٍ، خَشْيَةَ الصَّدَقَةِ». [رواه البخاري: ١٤٥٠]

**733.** Ənəs ﷺ rəvayət edir ki, Əbu Bəkr ﷺ ona (məktub) yazıb Peyğəmbərin ﷺ vacib buyurduğunu bildirmişdir: “Zəkat verməmək üçün[2] (zəkat verilməsi vacib olan) cəm olunmuş malı ayırmaq, ayrı-ayrı olan malı da cəm etmək olmaz.” (əl-Buxari, 1450)

---

[1] Məlumdur ki, Peyğəmbər ﷺ və onun əhli-beytinə ﷺ sədəqə yemək olmaz. Lakin burada Peyğəmbər ﷺ qoçun Nuseybəyə ﵄ sədəqə olaraq verildiyini, sonra da ondan bir pay Aişəyə ﵄ hədiyyə edildiyini biləndə ondan yeməyə rüsxət vermişdir.

[2] Şəriətə görə bir adamın qırx qoyundan yüz iyirmi qoyuna qədər qoyunları olarsa, zəkat olaraq ondan yalnız bir qoyun götürülməlidir. Zəkat malının azalması o deməkdir ki, hər birinin qırx qoyunu olan üç nəfər qoyunlarını birləşdirib bir adamın olduğunu elan edə bilər və beləliklə də, zəkat olaraq üç qoyun deyil, bir qoyun verə bilərlər ki, bu da şəriət baxımından haram sayılır. O ki qaldı malın artmasına, zəkat yığan adam bir adamın yüz iyirmi qoyununu üç hissəyə ayırıb, sonra hər qırx qoyundan bir qoyun götürə bilər və beləliklə də, yüz iyirmi qoyuna üç qoyun götürmüş olar ki, bu da şəriətə görə haram sayılır.

## ٢٣– باب: مَا كَانَ مِنْ خَلِيطَيْنِ فَإِنَّهُمَا يَتَرَاجَعَانِ بَيْنَهُمَا بِالسَّوِيَّةِ

## 23-cü fəsil. Şərikli maldan zəkat verildiyi zaman şəriklər (qoyduqları mala) müvafiq miqdarda zəkat verməlidirlər

٧٣٤ – عَنْ أَنَسٍ ﷺ أَنَّ أَبَا بَكْرٍ ﷺ كَتَبَ لَهُ الَّتِي فَرَضَ رَسُولُ اللَّهِ ﷺ: «وَمَا كَانَ مِنْ خَلِيطَيْنِ فَإِنَّهُمَا يَتَرَاجَعَانِ بَيْنَهُمَا بِالسَّوِيَّةِ». [رواه البخاري: ١٤٥١]

**734.** Ənəs ﷺ rəvayət edir ki, Əbu Bəkr ﷺ ona (məktub) yazıb Peyğəmbərin ﷺ vacib buyurduğunu bildirmişdir: "Şərikli maldan zəkat verildiyi zaman şəriklər (qoyduqları mala) müvafiq miqdarda zəkat verməlidirlər." (əl-Buxari, 1451)

## ٢٤– باب: زَكَاةُ الإِبِلِ

## 24-cü fəsil. Dəvələrin zəkatı

٧٣٥ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ أَنَّ أَعْرَابِيًّا سَأَلَ رَسُولَ اللَّهِ ﷺ عَنِ الْهِجْرَةِ فَقَالَ: «وَيْحَكَ، إِنَّ شَأْنَهَا شَدِيدٌ، فَهَلْ لَكَ مِنْ إِبِلٍ تُؤَدِّي صَدَقَتَهَا». قَالَ نَعَمْ. قَالَ: «فَاعْمَلْ مِنْ وَرَاءِ الْبِحَارِ فَإِنَّ اللَّهَ لَنْ يَتِرَكَ مِنْ عَمَلِكَ شَيْئًا». [رواه البخاري: ١٤٥٢]

**735.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib hicrət etmək haqqında ondan soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Ay yazıq, həqiqətən, hicrət çox çətin bir işdir. Zəkatını verəcəyin dəvən varmı?" O: "Bəli!"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Dənizin o tayında olsan belə, (zəkatını) verməyə davam et. Çünki Allah sənin əməllərindən heç birini (əvəzsiz) qoymayacaq." (əl-Buxari, 1452)

## ٢٥– باب: مَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ بِنْتِ مَخَاضٍ وَلَيْسَتْ عِنْدَهُ

## 25-ci fəsil. Bir yaşına çatmış dişi dəvəni zəkat verməyə mükəlləf olan, ancaq belə bir dəvəsi olmayan kimsə haqqında

٧٣٦ – عَنْ أَنَسٍ ﷺ أَنَّ أَبَا بَكْرٍ ﷺ كَتَبَ لَهُ فَرِيضَةَ الصَّدَقَةِ الَّتِي أَمَرَ اللَّهُ رَسُولَهُ ﷺ: «مَنْ بَلَغَتْ عِنْدَهُ مِنَ الإِبِلِ صَدَقَةُ الْجَذَعَةِ، وَلَيْسَتْ عِنْدَهُ جَذَعَةٌ وَعِنْدَهُ حِقَّةٌ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ الْحِقَّةُ وَيَجْعَلُ مَعَهَا شَاتَيْنِ إِنِ اسْتَيْسَرَتَا لَهُ أَوْ عِشْرِينَ دِرْهَمًا، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ الْحِقَّةِ وَلَيْسَتْ عِنْدَهُ الْحِقَّةُ وَعِنْدَهُ الْجَذَعَةُ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ الْجَذَعَةُ، وَيُعْطِيهِ الْمُصَدِّقُ عِشْرِينَ دِرْهَمًا أَوْ شَاتَيْنِ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ الْحِقَّةِ وَلَيْسَتْ عِنْدَهُ إِلاَّ بِنْتُ لَبُونٍ فَإِنَّهَا تُقْبَلُ مِنْهُ بِنْتُ لَبُونٍ، وَيُعْطِي شَاتَيْنِ أَوْ عِشْرِينَ دِرْهَمًا، وَمَنْ بَلَغَتْ صَدَقَتُهُ بِنْتَ لَبُونٍ وَعِنْدَهُ حِقَّةٌ فَإِنَّهَا تُقْبَلُ مِنْهُ الْحِقَّةُ وَيُعْطِيهِ الْمُصَدِّقُ عِشْرِينَ دِرْهَمًا أَوْ شَاتَيْنِ، وَمَنْ بَلَغَتْ صَدَقَتُهُ بِنْتَ لَبُونٍ وَلَيْسَتْ عِنْدَهُ وَعِنْدَهُ بِنْتُ مَخَاضٍ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ بِنْتُ مَخَاضٍ وَيُعْطِي مَعَهَا عِشْرِينَ دِرْهَمًا أَوْ شَاتَيْنِ». [رواه البخاري: ١٤٥٣]

**736.** Ənəs ﷺ rəvayət edir ki, Əbu Bəkr ﷺ ona (məktub) yazıb Allahın Öz elçisinə ﷺ zəkatla bağlı əmr etdiklərini bildirmişdir. (Məktubda deyilirdi:) "Əgər dördillik dişi dəvəni verməyə mükəlləf olan kimsənin dördillik dişi dəvəsi yoxdursa, lakin üçillik dişi dəvəsi varsa, bu dəvə (zəkat olaraq) ondan qəbul edilməli və

bundan əlavə (zəkat yığan adam) imkan daxilində ondan iki qoç və ya iyirmi dirhəm götürməlidir. Əgər üçillik dişi dəvəni verməyə mükəlləf olan kimsənin üçillik dişi dəvəsi yoxdursa, lakin dördillik dişi dəvəsi varsa, bu dəvə (zəkat olaraq) ondan qəbul edilməlidir. Fəqət zəkat yığan adam ona iyirmi dirhəm və ya iki qoç verməlidir. Əgər üçillik dişi dəvəni verməyə mükəlləf olan kimsənin ancaq ikiillik dişi dəvəsi varsa, bu dəvə ondan qəbul edilməli, üstəlik o, əlavə olaraq iki qoç və ya iyirmi dirhəm verməlidir. Əgər ikiillik dişi dəvəni verməyə mükəlləf olan kimsənin üçillik dişi dəvəsi varsa, o dəvə ondan qəbul edilməlidir. Fəqət zəkat yığan adam ona iyirmi dirhəm və ya iki qoç verməlidir. Əgər ikiillik dişi dəvəni verməyə mükəlləf olan kimsənin ancaq birillik dişi dəvəsi varsa, bu dəvə ondan qəbul edilməli, üstəlik o, əlavə olaraq iyirmi dirhəm və ya iki qoç verməlidir." (əl-Buxari, 1453)

## 26-cı fəsil. Qoyunların zəkatı

## ٢٦- باب: زَكَاةُ الْغَنَمِ

٧٣٧ – عَنْ أَنَسٍ ﷺ أَنَّ أَبَا بَكْرٍ ﷺ كَتَبَ لَهُ هَذَا الْكِتَابَ لَمَّا وَجَّهَهُ إِلَى الْبَحْرَيْنِ:

**بِسْمِ اللَّهِ الرَّحْمَنِ الرَّحِيمِ**

«هَذِهِ فَرِيضَةُ الصَّدَقَةِ الَّتِي فَرَضَ رَسُولُ اللَّهِ ﷺ عَلَى الْمُسْلِمِينَ، وَالَّتِي أَمَرَ اللَّهُ بِهَا رَسُولَهُ، فَمَنْ سُئِلَهَا مِنَ الْمُسْلِمِينَ عَلَى وَجْهِهَا فَلْيُعْطِهَا، وَمَنْ سُئِلَ فَوْقَهَا فَلاَ يُعْطِ فِي أَرْبَعٍ وَعِشْرِينَ مِنَ الإِبِلِ فَمَا دُونَهَا مِنَ الْغَنَمِ مِنْ كُلِّ خَمْسٍ شَاةٌ، إِذَا بَلَغَتْ خَمْسًا وَعِشْرِينَ إِلَى خَمْسٍ وَثَلاَثِينَ فَفِيهَا بِنْتُ مَخَاضٍ أُنْثَى، فَإِذَا بَلَغَتْ سِتًّا وَثَلاَثِينَ إِلَى خَمْسٍ وَأَرْبَعِينَ فَفِيهَا بِنْتُ لَبُونٍ أُنْثَى، فَإِذَا بَلَغَتْ سِتًّا وَأَرْبَعِينَ إِلَى سِتِّينَ فَفِيهَا حِقَّةٌ طَرُوقَةُ الْجَمَلِ، فَإِذَا بَلَغَتْ وَاحِدَةً وَسِتِّينَ إِلَى خَمْسٍ وَسَبْعِينَ فَفِيهَا جَذَعَةٌ، فَإِذَا بَلَغَتْ – يَعْنِي – سِتًّا وَسَبْعِينَ إِلَى تِسْعِينَ فَفِيهَا بِنْتَا لَبُونٍ، فَإِذَا بَلَغَتْ إِحْدَى وَتِسْعِينَ إِلَى عِشْرِينَ وَمِائَةٍ فَفِيهَا حِقَّتَانِ طَرُوقَتَا الْجَمَلِ، فَإِذَا زَادَتْ عَلَى عِشْرِينَ وَمِائَةٍ فَفِي كُلِّ أَرْبَعِينَ بِنْتُ لَبُونٍ، وَفِي كُلِّ خَمْسِينَ حِقَّةٌ، وَمَنْ لَمْ يَكُنْ مَعَهُ إِلاَّ أَرْبَعٌ مِنَ الإِبِلِ فَلَيْسَ فِيهَا صَدَقَةٌ، إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا، فَإِذَا بَلَغَتْ خَمْسًا مِنَ الإِبِلِ فَفِيهَا شَاةٌ، وَفِي صَدَقَةِ الْغَنَمِ فِي سَائِمَتِهَا إِذَا كَانَتْ أَرْبَعِينَ إِلَى عِشْرِينَ وَمِائَةٍ شَاةٌ، فَإِذَا زَادَتْ عَلَى عِشْرِينَ وَمِائَةٍ إِلَى مِائَتَيْنِ شَاتَانِ، فَإِذَا زَادَتْ عَلَى مِائَتَيْنِ إِلَى ثَلاَثِمِائَةٍ فَفِيهَا ثَلاَثٌ، فَإِذَا زَادَتْ عَلَى ثَلاَثِمِائَةٍ فَفِي كُلِّ مِائَةٍ شَاةٌ، فَإِذَا كَانَتْ سَائِمَةُ الرَّجُلِ نَاقِصَةً مِنْ أَرْبَعِينَ شَاةً وَاحِدَةً فَلَيْسَ فِيهَا صَدَقَةٌ، إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا، وَفِي الرِّقَةِ رُبْعُ الْعُشْرِ، فَإِنْ لَمْ تَكُنْ إِلاَّ تِسْعِينَ وَمِائَةً فَلَيْسَ فِيهَا شَيْءٌ، إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا». [رواه البخاري: ١٤٥٤]

**737.** Ənəs ﷺ rəvayət edir ki, Əbu Bəkr ﷺ onu Bəhreynə göndərəndə ona belə bir məktub yazmışdır:

**Mərhəmətli və Rəhmli Allahın adı ilə!**

Bu, Peyğəmbərin ﷺ müsəlmanlara vacib buyurduğu, habelə Allahın Öz elçisinə ﷺ vacib buyurduğu zəkatdır; hansı bir müsəlmandan burada göstərilən miqdarda zəkat tələb olunarsa, onu versin; bundan artığı tələb olunsa, verməsin.

**Dəvələrin sayı:**

1-24-ə qədər olarsa, hər beş dəvə üçün bir qoyun,
25-35-ə qədər olarsa, birillik bir dişi dəvə,
36-45-ə qədər olarsa, ikiillik bir dişi dəvə,
46-60-a qədər olarsa, cütləşmək həddinə çatmış üçillik bir dişi dəvə,

61-75-ə qədər olarsa, dördillik bir dişi dəvə,
76-90-a qədər olarsa, bir cüt ikiillik dişi dəvə,
91-120-ə qədər olarsa, cütləşmək həddinə çatmış bir cüt üçillik dişi dəvə,
120 dəvədən yuxarı olarsa, hər qırx dəvə üçün ikiillik bir dişi dəvə, hər əlli dəvə üçün üçillik bir dişi dəvə zəkat verilməlidir.

Cəmi dörd dəvəsi olan kimsəyə zəkat vermək vacib deyil. Lakin sahibi istəsə, (bir qoyun) verə bilər. Dəvələrinin sayı beşə çatdıqda isə bir qoyun verməlidir.

**Qoyunların zəkatı:**
Otlaqda otarılmış qoyunların sayı
40-120-ə qədər olarsa, bir qoyun,
121-200-ə qədər olarsa, iki qoyun,
201-300-ə qədər olarsa, üç qoyun,
300 qoyundan yuxarı olarsa, hər yüz qoyun üçün bir qoyun zəkat verilməlidir.

Əgər adamın otlaqda otarılan qoyunların sayı qırxdan azdırsa, (bu sayın tam olması üçün) bircə qoyun belə çatmırsa, onda o kimsəyə zəkat vermək vacib deyil. Lakin sahibi istəsə, (bunun üçün də zəkat) verə bilər.

Gümüşün zəkatına gəlincə, onun (miqdarı 200 dirhəm[1] olarsa,) qırxdan bir hissəsi zəkat verilməlidir. Cəmi 190 dirhəm gümüşü olan kimsəyə isə zəkat vermək vacib deyil. Lakin sahibi istəsə, (bunun üçün də zəkat) verə bilər." (əl-Buxari, 1454)

## 27-ci fəsil. Zəkat üçün ancaq sağlam heyvan götürülməlidir

## ٢٧- باب: لاَ يُؤْخَذُ فِى الصَّدَقَةِ إِلاَّ السَّلِيم

٧٣٨ – عَنْ أَنَسٍ ﷺ أَنَّ أَبَا بَكْرٍ ﷺ كَتَبَ لَهُ {الصَّدَقَةَ} الَّتِى أَمَرَ اللَّهُ رَسُولَهُ ﷺ «وَلاَ يُخْرَجُ فِى الصَّدَقَةِ هَرِمَةٌ، وَلاَ ذَاتُ عَوَارٍ، وَلاَ تَيْسٌ، إِلاَّ مَا شَاءَ الْمُصَدِّقُ». [رواه البخاري: ١٤٥٥]

**738.** Ənəs ﷺ rəvayət edir ki, Əbu Bəkr ﷺ ona (məktub) yazıb Allahın Öz elçisinə ﷺ zəkatla bağlı əmr etdiklərini bildirmişdir. (Məktubda deyilirdi:) "Zəkat yığan adam istəməyincə – nə qoca heyvan, nə qüsurlu heyvan, nə də erkək keçi zəkat verilməməlidir." (əl-Buxari, 1455)

## 28-ci fəsil. Zəkat olaraq insanların mallarının ən yaxşısı götürülməməlidir

## ٢٨- باب: لاَ تُؤْخَذُ كَرَائِمُ أَمْوَالِ النَّاسِ فِى الصَّدَقَةِ

٧٣٩ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ لَمَّا بَعَثَ مُعَاذًا ﷺ عَلَى الْيَمَنِ قَالَ: «إِنَّكَ تَقْدَمُ عَلَى قَوْمٍ أَهْلِ كِتَابٍ، فَلْيَكُنْ أَوَّلَ مَا تَدْعُوهُمْ إِلَيْهِ عِبَادَةُ اللَّهِ، فَإِذَا عَرَفُوا اللَّهَ فَأَخْبِرْهُمْ أَنَّ اللَّهَ قَدْ فَرَضَ عَلَيْهِمْ خَمْسَ صَلَوَاتٍ فِى

[1] 708-ci hədisin qeydlərinə bax.

يَوْمِهِمْ وَلَيْلَتِهِمْ، فَإِذَا فَعَلُوا، فَأَخْبِرْهُمْ أَنَّ اللَّهَ فَرَضَ عَلَيْهِمْ زَكَاةً {تُؤْخَذُ} مِنْ أَمْوَالِهِمْ وَتُرَدُّ عَلَى فُقَرَائِهِمْ، فَإِذَا أَطَاعُوا بِهَا فَخُذْ مِنْهُمْ، وَتَوَقَّ كَرَائِمَ أَمْوَالِ النَّاسِ». [رواه البخاري: ١٤٥٨]

**739.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Muaz ibn Cəbəli ﷺ Yəmənə göndərərkən demişdir: "Sən Kitab əhlindən olan bir qövmün yanına gedirsən. Elə isə ilk əvvəl onları Allaha ibadət etməyə dəvət et. Əgər Allahı tanısalar, onlara xəbər ver ki, Allah onlara gecə və gündüz beş vaxt namaz qılmağı vacib buyurmuşdur. Əgər buna əməl etsələr, onları xəbərdar et ki, Allah onlara zəkat verməyi – dövlətlilərindən götürülüb kasıblarına paylanılmağı vacib buyurmuşdur. Buna itaət etsələr, (zəkatı) onlardan götür. Lakin insanların mallarının ən qiymətlisini götürməkdən çəkin!" (əl-Buxari, 1458)

## 29-cu fəsil. Zəkatı qohum-əqrəbaya vermək

## ٢٩ – باب: الزَّكَاةُ عَلَى الأَقَارِبِ

٧٤٠ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: كَانَ أَبُو طَلْحَةَ ﷺ أَكْثَرَ الأَنْصَارِ بِالْمَدِينَةِ مَالاً مِنْ نَخْلٍ، وَكَانَ أَحَبَّ أَمْوَالِهِ إِلَيْهِ بَيْرُحَاءَ وَكَانَتْ مُسْتَقْبِلَةَ الْمَسْجِدِ، وَكَانَ رَسُولُ اللَّهِ ﷺ يَدْخُلُهَا وَيَشْرَبُ مِنْ مَاءٍ فِيهَا طَيِّبٍ قَالَ أَنَسٌ ﷺ فَلَمَّا أُنْزِلَتْ هَذِهِ الآيَةُ ﴿لَن تَنَالُوا۟ ٱلْبِرَّ حَتَّىٰ تُنفِقُوا۟ مِمَّا تُحِبُّونَ﴾ قَامَ أَبُو طَلْحَةَ ﷺ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ يَا رَسُولَ اللَّهِ. إِنَّ اللَّهَ تَبَارَكَ وَتَعَالَى يَقُولُ ﴿لَن تَنَالُوا۟ ٱلْبِرَّ حَتَّىٰ تُنفِقُوا۟ مِمَّا تُحِبُّونَ﴾ وَإِنَّ أَحَبَّ أَمْوَالِي إِلَيَّ بَيْرُحَاءَ، وَإِنَّهَا صَدَقَةٌ لِلَّهِ أَرْجُو بِرَّهَا وَذُخْرَهَا عِنْدَ اللَّهِ، فَضَعْهَا يَا رَسُولَ اللَّهِ حَيْثُ أَرَاكَ اللَّهُ. قَالَ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «بَخْ، ذَلِكَ مَالٌ رَابِحٌ، ذَلِكَ مَالٌ رَابِحٌ، وَقَدْ سَمِعْتُ مَا قُلْتَ وَإِنِّي أَرَى أَنْ تَجْعَلَهَا فِي الأَقْرَبِينَ». فَقَالَ أَبُو طَلْحَةَ ﷺ أَفْعَلُ يَا رَسُولَ اللَّهِ. فَقَسَمَهَا أَبُو طَلْحَةَ ﷺ فِي أَقَارِبِهِ وَبَنِي عَمِّهِ. [رواه البخاري: ١٤٦١]

**740.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Ənsarın arasında Mədinədə ən çox xurma ağacı olan (əshabə) Əbu Təlhə idi. Bunlardan onun ən çox sevdiyi məscidin qarşı tərəfində yerləşən Beyruhə bağı idi. Peyğəmbər ﷺ tez-tez o bağa gəlib, oradakı dadlı sudan içərdi. (Nəhayət:) "Sevdiyiniz şeylərdən *Allah yolunda* xərcləməyincə xeyrə nail olmayacaqsınız..." ayəsi nazil olduqdan sonra Əbu Təlhə Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah! Allah təbarəkə və təalə buyurur: "Sevdiyiniz şeylərdən *Allah yolunda* xərcləməyincə xeyrə nail olmayacaqsınız..." Mənim də ən çox sevdiyim mal Beyruhə bağıdır. Mən onu Allah yolunda sədəqə verirəm və ümid edirəm ki, Allah yanında bundan da xeyirlisini, axirət mükafatını tapacağam. Götür onu, Allahın sənə məsləhət gördüyü işlərə sərf et, ya Rəsulullah!" Peyğəmbər ﷺ buyurdu: "Çox gözəl! Bu mal qazanc gətirəcək, mütləq qazanc gətirəcək! Sənin dediyini eşitdim, lakin məsləhət görürəm ki, bunu öz qohum-əqrəbana sərf edəsən." Əbu Təlhə: "Belə də edərəm, ya Rəsulallah!"– dedi, sonra da onu qohum-əqrəbasının və əmisi oğullarının arasında paylaşdırdı." (əl-Buxari, 1461)

٧٤١ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ خَرَجَ رَسُولُ اللَّهِ ﷺ فِي أَضْحًى أَوْ فِطْرٍ إِلَى الْمُصَلَّى ثُمَّ انْصَرَفَ فَوَعَظَ النَّاسَ وَأَمَرَهُمْ بِالصَّدَقَةِ فَقَالَ: «أَيُّهَا النَّاسُ تَصَدَّقُوا». فَمَرَّ عَلَى النِّسَاءِ فَقَالَ: «يَا مَعْشَرَ النِّسَاءِ تَصَدَّقْنَ، فَإِنِّي رَأَيْتُكُنَّ أَكْثَرَ أَهْلِ النَّارِ». فَقُلْنَ وَبِمَ ذَلِكَ يَا رَسُولَ اللَّهِ قَالَ: «تُكْثِرْنَ اللَّعْنَ وَتَكْفُرْنَ الْعَشِيرَ، مَا رَأَيْتُ مِنْ نَاقِصَاتِ

عَقْلٍ وَدِينٍ أَذْهَبَ لِلُبِّ الرَّجُلِ الْحَازِمِ مِنْ إِحْدَاكُنَّ يَا مَعْشَرَ النِّسَاءِ». ثُمَّ انْصَرَفَ فَلَمَّا صَارَ إِلَى مَنْزِلِهِ جَاءَتْ زَيْنَبُ امْرَأَةُ ابْنِ مَسْعُودٍ رضي الله عنها تَسْتَأْذِنُ عَلَيْهِ فَقِيلَ يَا رَسُولَ اللَّهِ هَذِهِ زَيْنَبُ فَقَالَ: «أَيُّ الزَّيَانِبِ». فَقِيلَ امْرَأَةُ ابْنِ مَسْعُودٍ رضي الله عنها. قَالَ: «نَعَمِ ائْذَنُوا لَهَا». فَأُذِنَ لَهَا قَالَتْ يَا نَبِيَّ اللَّهِ إِنَّكَ أَمَرْتَ الْيَوْمَ بِالصَّدَقَةِ، وَكَانَ عِنْدِي حُلِيٌّ لِي، فَأَرَدْتُ أَنْ أَتَصَدَّقَ بِهِ، فَزَعَمَ ابْنُ مَسْعُودٍ أَنَّهُ وَوَلَدَهُ أَحَقُّ مَنْ تَصَدَّقْتُ بِهِ عَلَيْهِمْ. فَقَالَ النَّبِيُّ ﷺ: «صَدَقَ ابْنُ مَسْعُودٍ، زَوْجُكِ وَوَلَدُكِ أَحَقُّ مَنْ تَصَدَّقْتِ بِهِ عَلَيْهِمْ». [رواه البخاري: ١٤٦٢]

**741.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ qurban yaxud fitrə bayramında namaz qılınan yerə getdi. (Namaz qıldıqdan sonra) camaata moizə oxudu və onlara sədəqə verməyi əmr edib buyurdu: "Ey insanlar, sədəqə verin!" Sonra qadınların yanına gedib buyurdu: "Ey qadınlar, sədəqə verin! Çünki mənə Cəhənnəm əhlinin əksəriyyətinin siz qadınlar olduğu göstərildi." Qadınlar: "Nəyə görə, ya Rəsulullah?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Çünki siz (insanları) tez-tez lənətləyir və ərlərinizə qarşı nankorluq edirsiniz. Mən ağıllı və ehtiyatlı bir adamın sizin qədər həm ağıl, həm də din baxımından nöqsanlı olduğunu görmədim." (Bunu deyəndən sonra o) çıxıb getdi. Peyğəmbər ﷺ evinə gəlib çatdıqda ibn Məsudun xanımı Zeynəb Peyğəmbərin ﷺ yanına daxil olmaq üçün izn istədi. Peyğəmbərə ﷺ: "Ya Rəsulullah, bu Zeynəbdir"– dedilər. O: "Hansı Zeynəbdir?"– deyə soruşdu. (Ona): "İbn Məsudun xanımı Zeynəbdir"– dedilər. O: "Bəli, ona izn verin"– deyə buyurdu və ona (içəri daxil olmağa) izn verdilər. Zeynəb رضي الله عنها dedi: "Ey Allahın peyğəmbəri, bu gün sən (bizə) sədəqə verməyi əmr etdin. Mənim də özümə məxsus qır-qızılım var idi. Mən onu sədəqə vermək istədim, lakin ibn Məsud özünün və oğlunun (bu malda) onu sədəqə verəcəyim kimsədən daha çox haqqı olduğunu iddia etdi." Peyğəmbər ﷺ buyurdu: "İbn Məsud doğru söyləmişdir. Sənin ərin və övladın sədəqə verəcəyin (insanlar arasında) ən çox haqqı olan kimsələrdir." (əl-Buxari, 1462)

## ٣٠– باب: لَيْسَ عَلَى الْمُسْلِمِ فِي فَرَسِهِ صَدَقَةٌ

## 30-cu fəsil. Müsəlman öz atının zəkatını verməyə mükəlləf deyildir

**٧٤٢** – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «لَيْسَ عَلَى الْمُسْلِمِ فِي فَرَسِهِ وَغُلاَمِهِ صَدَقَةٌ». [رواه البخاري: ١٤٦٣]

**742.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlman bəndə öz atının və köləsinin zəkatını verməyə mükəlləf deyildir." (əl-Buxari, 1463)

## ٣١– باب: الصَّدَقَةُ عَلَى الْيَتَامَى

## 31-ci fəsil. Sədəqəni yetimlərə vermək

**٧٤٣** – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ رضي الله عنه: أَنَّ النَّبِيَّ ﷺ جَلَسَ ذَاتَ يَوْمٍ عَلَى الْمِنْبَرِ وَجَلَسْنَا حَوْلَهُ فَقَالَ: «إِنِّي مِمَّا أَخَافُ عَلَيْكُمْ مِنْ بَعْدِي مَا يُفْتَحُ عَلَيْكُمْ مِنْ زَهْرَةِ الدُّنْيَا وَزِينَتِهَا». فَقَالَ رَجُلٌ يَا رَسُولَ اللَّهِ أَوَيَأْتِي الْخَيْرُ بِالشَّرِّ فَسَكَتَ النَّبِيُّ ﷺ فَقِيلَ لَهُ مَا شَأْنُكَ تُكَلِّمُ النَّبِيَّ ﷺ وَلاَ يُكَلِّمُكَ فَرَأَيْنَا أَنَّهُ يُنْزَلُ عَلَيْهِ. قَالَ: فَمَسَحَ عَنْهُ الرُّحَضَاءَ

فَقَالَ: «أَيْنَ السَّائِلُ» وَكَأَنَّهُ حَمِدَهُ. فَقَالَ: «إِنَّهُ لاَ يَأْتِى الْخَيْرُ بِالشَّرِّ، وَإِنَّ مِمَّا يُنْبِتُ الرَّبِيعُ يَقْتُلُ أَوْ يُلِمُّ إِلاَّ آكِلَةَ الْخَضْرَاءِ، أَكَلَتْ حَتَّى إِذَا امْتَدَّتْ خَاصِرَتَاهَا اسْتَقْبَلَتْ عَيْنَ الشَّمْسِ، فَثَلَطَتْ وَبَالَتْ وَرَتَعَتْ، وَإِنَّ هَذَا الْمَالَ خَضِرَةٌ حُلْوَةٌ، فَنِعْمَ صَاحِبُ الْمُسْلِمِ مَا أَعْطَى مِنْهُ الْمِسْكِينَ وَالْيَتِيمَ وَابْنَ السَّبِيلِ - أَوْ كَمَا قَالَ النَّبِىُّ ﷺ وَإِنَّهُ مَنْ يَأْخُذُهُ بِغَيْرِ حَقِّهِ كَالَّذِى يَأْكُلُ وَلاَ يَشْبَعُ، وَيَكُونُ شَهِيدًا عَلَيْهِ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ١٤٦٥]

**743.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Bir dəfə Peyğəmbər ﷺ minbərdə oturdu və biz də onun ətrafında oturduq. Peyğəmbər ﷺ buyurdu: "Mən (bu dünyadan) köçəndən sonra sizin üçün ən çox qorxduğum şeylərdən biri dünyanın zövqü-səfa və bər-bəzək (qapılarının) sizin üzünüzə açılmasıdır." Bir nəfər soruşdu: "Ey Allahın elçisi, xeyirli bir şey özü ilə şər gətirə bilərmi?" Peyğəmbər ﷺ susdu. (Bəziləri) həmin adamdan soruşdular: "Nə olub, niyə sən ondan söz soruşursan, o isə sənə cavab vermir?" Sonra bizə agah oldu ki, ona vəhy nazil olur. (Bir müddət keçdikdən) sonra Peyğəmbər ﷺ (üzündəki) təri sildi və sanki sual verən adamı tərifləyərək: "Soruşan adam haradadır?"– dedi. Sonra buyurdu: "Həqiqətən, xeyir özü ilə şər gətirməz! Doğrusu, baharda yetişən bitkilərin bəzisi (onu yeyən heyvanı) öldürür yaxud zəhərləyir. Yalnız yaşıl ot yeyən heyvanlardan başqa. Bu heyvanlar doyanadək (otdan) yeyir və nəhayət, böyrü şişdikdən sonra yerə uzanıb özünü günə verir. Sonra qalxıb təbii ehtiyacını rəf edir və (yenidən yaşıl otdan) bol-bol yeyir. Həqiqətən, bu (dünya) malı yaşıl ot (kimi) şirindir. Malından kasıblara, yetimlərə və müsafirlərə verən varlı müsəlman nə gözəl (bəndədir)! (Peyğəmbər ﷺ buna bənzər söz söylədi. Sonra buyurdu:) Haqsız yolla mal-dövlət əldə edən adam, (əməllicə) yeyən, lakin doymayan kimsəyə bənzəyir. Qiyamət günü isə bu mal-dövlət onun əleyhinə şahidlik edəcək." (əl-Buxari, 1465)

## 32-ci fəsil. (Qadının) zəkatı ərinə və himayəsində olan yetimə verməsi

## ٣٢- باب: الزَّكَاةُ عَلَى الزَّوْجِ وَالأَيْتَامِ فِى الْحَجْرِ

٧٤٤ - عَنْ زَيْنَبَ امْرَأَةِ عَبْدِ اللَّهِ رضي الله عنها قَالَتْ كُنْتُ فِى الْمَسْجِدِ فَرَأَيْتُ النَّبِىَّ ﷺ فَقَالَ: «تَصَدَّقْنَ وَلَوْ مِنْ حُلِيِّكُنَّ». وَكَانَتْ زَيْنَبُ تُنْفِقُ عَلَى عَبْدِ اللَّهِ وَأَيْتَامٍ فِى حَجْرِهَا، قَالَ فَقَالَتْ لِعَبْدِ اللَّهِ سَلْ رَسُولَ اللَّهِ ﷺ أَيَجْزِى عَنِّى أَنْ أُنْفِقَ عَلَيْكَ وَعَلَى أَيْتَامِى فِى حَجْرِى مِنَ الصَّدَقَةِ فَقَالَ سَلِى أَنْتِ رَسُولَ اللَّهِ ﷺ. فَانْطَلَقْتُ إِلَى النَّبِىِّ ﷺ. فَوَجَدْتُ امْرَأَةً مِنَ الأَنْصَارِ عَلَى الْبَابِ، حَاجَتُهَا مِثْلُ حَاجَتِى، فَمَرَّ عَلَيْنَا بِلاَلٌ فَقُلْنَا سَلِ النَّبِىَّ ﷺ أَيَجْزِى عَنِّى أَنْ أُنْفِقَ عَلَى زَوْجِى وَأَيْتَامٍ لِى فِى حَجْرِى وَقُلْنَا لاَ تُخْبِرْ بِنَا. فَدَخَلَ فَسَأَلَهُ فَقَالَ: «مَنْ هُمَا». قَالَ زَيْنَبُ قَالَ: «أَىُّ الزَّيَانِبِ». قَالَ امْرَأَةُ عَبْدِ اللَّهِ رضي الله عنها. قَالَ: «نَعَمْ لَهَا أَجْرَانِ أَجْرُ الْقَرَابَةِ وَأَجْرُ الصَّدَقَةِ». [رواه البخاري: ١٤٦٦]

**744.** Rəvayət edilir ki, Abdullahın zövcəsi Zeynəb ﷺ demişdir: "Mən məsciddə ikən Peyğəmbəri ﷺ gördüm. O buyurdu: "(Ey qadınlar,) heç olmasa, zinət əşyalarınızdan sədəqə verin!"

(Ravi Amr ibn əl-Haris dedi:) "Zeynəb sədəqəni Abdullaha[1] və evindəki yetimlərə payladı. Sonra da Abdullaha dedi: "Rəsulullahdan ﷺ soruş (görək),

[1] Burada Zeynəbin ﷺ əri Abdullah ibn Məsud ﷺ nəzərdə tutulur.

sənə və evimdəki yetimlərə verdiyim sədəqə (zəkat kimi) qəbul olunurmu?" Abdullah: "Özün Rəsulullahdan ﷺ soruş"– dedi.

(Zeynəb dedi:) "Mən Peyğəmbərin ﷺ yanına getdim və qapının ağzında mənim kimi sual vermək istəyən ənsardan olan bir qadına rast gəldim. (Bir qədər) sonra Bilal bizim yanımıza gəldi. Hər birimiz (ona eyni sualı verib) dedik: "Rəsulullahdan ﷺ soruş (görək), ərimə və evimdəki yetimlərə verdiyim sədəqə (zəkat kimi) qəbul olunurmu?" Sonra (Bilala): "Bizim kim olduğumuzu ona bildirmə"– dedik. Bilal içəri daxil olub (bu haqda) Peyğəmbərdən ﷺ soruşduqda o: "Kimdir onlar?"– deyə soruşdu. Bilal: "Zeynəbdir"– dedi. Peyğəmbər ﷺ: "Hansı Zeynəbdir?"– deyə soruşdu. Bilal: "Abdullahın zövcəsidir"– dedi. Peyğəmbər ﷺ buyurdu: "Bəli, (qəbuldur) və o buna görə iki qat savab – həm qohumluğun savabını, həm də sədəqənin savabını qazanır." (əl-Buxari, 1466)

**٧٤٥** – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها قَالَتْ: قُلْتُ يَا رَسُولَ اللَّهِ أَلِيَ أَجْرٌ أَنْ أُنْفِقَ عَلَى بَنِي أَبِي سَلَمَةَ إِنَّمَا هُمْ بَنِيَّ؟ فَقَالَ: «أَنْفِقِي عَلَيْهِمْ، فَلَكِ أَجْرُ مَا أَنْفَقْتِ عَلَيْهِمْ». [رواه البخاري: ١٤٦٧]

**745.** Rəvayət edilir ki, Ummu Sələmə رضي الله عنها demişdir: "Mən dedim: Ya Rəsulullah, (malımdan) Əbu Sələmənin uşaqlarına xərclədiyimə görə mənə savab çatırmı? Axı, onlar həm də mənim uşaqlarımdır?" Peyğəmbər ﷺ buyurdu: "(Malından) onlara xərclə, xərclədiyin qədər savab qazanacaqsan." (əl-Buxari, 1467)

## 33-cü fəsil. Uca Allahın: «...kölələrin azad olunmasına, borclulara, Allah yolunda cihad edənlərə... məxsusdur...»[1] sözü

## ٣٣– باب: قَوْلُ اللَّهِ تَعَالَى ﴿وَفِي ٱلرِّقَابِ وَٱلْغَـٰرِمِينَ وَفِي سَبِيلِ ٱللَّهِ﴾

**٧٤٦** – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: أَمَرَ رَسُولُ اللَّهِ ﷺ بِالصَّدَقَةِ فَقِيلَ مَنَعَ ابْنُ جَمِيلٍ وَخَالِدُ بْنُ الْوَلِيدِ وَعَبَّاسُ بْنُ عَبْدِ الْمُطَّلِبِ. فَقَالَ النَّبِيُّ ﷺ: «مَا يَنْقِمُ ابْنُ جَمِيلٍ إِلاَّ أَنَّهُ كَانَ فَقِيرًا فَأَغْنَاهُ اللَّهُ وَرَسُولُهُ، وَأَمَّا خَالِدٌ فَإِنَّكُمْ تَظْلِمُونَ خَالِدًا، قَدِ احْتَبَسَ أَدْرَاعَهُ وَأَعْتُدَهُ فِي سَبِيلِ اللَّهِ، وَأَمَّا الْعَبَّاسُ بْنُ عَبْدِ الْمُطَّلِبِ فَعَمُّ رَسُولِ اللَّهِ ﷺ فَهِيَ عَلَيْهِ صَدَقَةٌ وَمِثْلُهَا مَعَهَا». [رواه البخاري: ١٤٦٨]

**746.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ zəkat verməyi əmr etmişdi. Sonra ona ibn Cəmilin, Xalid ibn Vəlidin رضي الله عنه və Abbas ibn Abdul-Muttəlibin رضي الله عنه zəkat verməkdən boyun qaçırdıqlarını söylədilər. Onda Peyğəmbər ﷺ buyurdu: "Niyə ibn Cəmil zəkat verməkdən boyun qaçırır?! Axı, Allah və Onun rəsulu[2] onu zəngin etmişlər. Xalidə gəlincə, siz ona qarşı haqsızlıq edirsiniz. O, öz zirehlərini, minik heyvanlarını və başqa yaraq-əsləhəsini Allah yolunda vəqf etmişdir[3]. O ki qaldı Abbas ibn Abdul-Muttəlibə, o, Rəsulullahın ﷺ əmisidir və o, öz zəkatını, üstəlik bir o qədərini də verməlidir." (əl-Buxari, 1468)

---

[1] ət-Tovbə, 60.

[2] Burada Peyğəmbərin ﷺ Allahla yanaşı özünü də xatırlatması ona görə idi ki, o, ibn Cəmilin رضي الله عنه İslam dininə daxil olmasına səbəbkar olmuş və elə bu səbəbdən də ibn Cəmil رضي الله عنه Allahın izni ilə varlanmışdır.

[3] Vəqf etmək – mal və mülkü Allah yolunda dini məqsədlər üçün ayırıb təxsis etmək deməkdir.

## ٣٤- باب: الاِسْتِعْفَافُ عَنِ الْمَسْأَلَةِ

## 34-cü fəsil. (Həyalı olub) dilənməkdən çəkinmək

٧٤٧ – عَنْ أَبِى سَعِيدٍ الْخُدْرِىِّ ﵁ أَنَّ نَاسًا مِنَ الأَنْصَارِ سَأَلُوا رَسُولَ اللَّهِ ﷺ فَأَعْطَاهُمْ، ثُمَّ سَأَلُوهُ فَأَعْطَاهُمْ، حَتَّى نَفِدَ مَا عِنْدَهُ فَقَالَ: «مَا يَكُونُ عِنْدِى مِنْ خَيْرٍ فَلَنْ أَدَّخِرَهُ عَنْكُمْ، وَمَنْ يَسْتَعْفِفْ يُعِفَّهُ اللَّهُ، وَمَنْ يَسْتَغْنِ يُغْنِهِ اللَّهُ، وَمَنْ يَتَصَبَّرْ يُصَبِّرْهُ اللَّهُ، وَمَا أُعْطِىَ أَحَدٌ عَطَاءً خَيْرًا وَأَوْسَعَ مِنَ الصَّبْرِ». [رواه البخاري: ١٤٦٩]

**747.** Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, ənsardan bəzi adamlar Peyğəmbərdən ﷺ (yardım) istədilər, o da onlara (istədiklərini) verdi. Sonra yenə istədilər, o, yenə onlara (istədiklərini) verdi. Nəhayət, əlində olanlar qurtardıqdan sonra dedi: "Əlimdə nə qədər nemət olursa-olsun, heç vaxt onu sizdən əsirgəməyəcəyəm. İffətli olmaq istəyəni Allah iffətli edər. (İnsanlara) möhtac olmaq istəməyən kimsəni Allah heç kəsə möhtac etməz. Səbir etməyə çalışan kimsəni Allah səbirli olmağa müvəffəq edər. Heç kəsə səbirdən daha xeyirli və daha böyük nemət verilməmişdir." (əl-Buxari, 1469)

٧٤٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «وَالَّذِى نَفْسِى بِيَدِهِ لأَنْ يَأْخُذَ أَحَدُكُمْ حَبْلَهُ فَيَحْتَطِبَ عَلَى ظَهْرِهِ خَيْرٌ لَهُ مِنْ أَنْ يَأْتِىَ رَجُلاً، فَيَسْأَلَهُ، أَعْطَاهُ أَوْ مَنَعَهُ». [رواه البخاري: ١٤٧٠]

**748.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Canım Əlində olan Allaha and olsun ki, birinizin ip götürüb bir şələ odun yığıb, belində (bazara) aparması, onun üçün kiməsə ağız açmaqdan daha xeyirlidir. Həm də bilmək olmaz, (o adam) ona istədiyini verəcək, ya imtina edəcək." (əl-Buxari, 1470)

٧٤٩ – عَنْ الزُّبَيْرِ بْنِ الْعَوَّامِ ﵁ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لأَنْ يَأْخُذَ أَحَدُكُمْ حَبْلَهُ فَيَأْتِىَ بِحُزْمَةِ الْحَطَبِ عَلَى ظَهْرِهِ فَيَبِيعَهَا فَيَكُفَّ اللَّهُ بِهَا وَجْهَهُ، خَيْرٌ لَهُ مِنْ أَنْ يَسْأَلَ النَّاسَ أَعْطَوْهُ أَوْ مَنَعُوهُ». [رواه البخاري: ١٤٧١]

**749.** Zubeyr ibn Əvvam ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Birinizin ip götürüb bir şələ odun yığıb belində (bazara) aparıb satması və bu səbəbdən Allahın köməyi ilə heç kəsə möhtac olmaması, onun üçün insanlara ağız açmaqdan daha xeyirlidir. Bir də ki, bilmək olmaz, (o adamlar) ona istədiyini verəcəklər, yoxsa imtina edəcəklər." (əl-Buxari, 1471)

٧٥٠ – عَنْ حَكِيمِ بْنِ حِزَامٍ ﵁ قَالَ سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ فَأَعْطَانِى، ثُمَّ سَأَلْتُهُ فَأَعْطَانِى، ثُمَّ سَأَلْتُهُ فَأَعْطَانِى ثُمَّ قَالَ: «يَا حَكِيمُ إِنَّ هَذَا الْمَالَ خَضِرَةٌ حُلْوَةٌ، فَمَنْ أَخَذَهُ بِسَخَاوَةِ نَفْسٍ بُورِكَ لَهُ فِيهِ، وَمَنْ أَخَذَهُ بِإِشْرَافِ نَفْسٍ لَمْ يُبَارَكْ لَهُ فِيهِ كَالَّذِى يَأْكُلُ وَلاَ يَشْبَعُ، الْيَدُ الْعُلْيَا خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى». قَالَ حَكِيمٌ ﵁ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ وَالَّذِى بَعَثَكَ بِالْحَقِّ لاَ أَرْزَأُ أَحَدًا بَعْدَكَ شَيْئًا حَتَّى أُفَارِقَ الدُّنْيَا، فَكَانَ أَبُو بَكْرٍ ﵁ يَدْعُو حَكِيمًا ﵁ إِلَى الْعَطَاءِ فَيَأْبَى أَنْ يَقْبَلَهُ مِنْهُ، ثُمَّ إِنَّ عُمَرَ ﵁ دَعَاهُ لِيُعْطِيَهُ فَأَبَى أَنْ يَقْبَلَ مِنْهُ شَيْئًا. فَقَالَ عُمَرُ ﵁ إِنِّى أُشْهِدُكُمْ يَا مَعْشَرَ الْمُسْلِمِينَ عَلَى حَكِيمٍ، أَنِّى أَعْرِضُ عَلَيْهِ حَقَّهُ مِنْ هَذَا الْفَىْءِ فَيَأْبَى أَنْ يَأْخُذَهُ. فَلَمْ يَرْزَأْ حَكِيمٌ أَحَدًا مِنَ النَّاسِ بَعْدَ رَسُولِ اللَّهِ ﷺ حَتَّى تُوُفِّىَ. [رواه البخاري: ١٤٧٢]

**750.** Rəvayət edilir ki, Həkim ibn Hizam ﵁ demişdir: "Mən Peyğəmbərdən ﷺ (bir şey) istədim, mənə (istədiyimi) verdi. Sonra yenə istədim, yenə verdi. Bir daha istədim, yenə verdi. Sonra dedi: "Ey Həkim! Həqiqətən, bu (dünya) malı şirin

meyvəyə bənzəyir. Kim onu hərislik göstərmədən götürərsə, bu onun üçün bərəkətli olar. Kim də onu acgözlüklə alarsa, onun bərəkətini görməz. (Beləsi,) yemək yeyən, lakin doymayan kimsəyə bənzəyir. (Həqiqətən,) uca əl, alçaq əldən daha xeyirlidir."

Həkim demişdir: "Mən dedim: "Ey Allahın elçisi! Səni haqq ilə göndərən Allaha and olsun ki, mən dünyadan köçənədək, səndən sonra bir də kimsədən bir şey götürməyəcəyəm."

Əbu Bəkr (öz xilafəti dövründə) Həkimi yanına çağırıb (qənimətdən) ona pay verdikdə, o, bunu ondan qəbul etməkdən imtina edərdi. Ömər ﷺ də (öz xilafəti dövründə) onu bu məqsədlə öz yanına çağırmış, o isə ondan nə isə qəbul etməkdən imtina etmişdi. Onda Ömər demişdir: "Ey müsəlmanlar, şahid olun ki, mən Həkimə bu qənimətdən onun haqqını verirəm, lakin o, bunu götürməkdən imtina edir."

Həkim Peyğəmbərdən ﷺ sonra, vəfat edənədək heç kəsdən heç nə götürmədi." (əl-Buxari, 1472)

## ٣٥- باب: مَنْ أَعْطَاهُ اللَّهُ شَيْئًا مِنْ غَيْرِ مَسْأَلَةٍ وَلاَ إِشْرَافِ نَفْسٍ

## 35-ci fəsil. Dilənməyən və nəfsini saxlayan kimsəyə Allahın (ruzi) verməsi

٧٥١ – عَنْ عُمَرَ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُعْطِينِى الْعَطَاءَ فَأَقُولُ أَعْطِهِ مَنْ هُوَ أَفْقَرُ إِلَيْهِ مِنِّى فَقَالَ: «خُذْهُ، إِذَا جَاءَكَ مِنْ هَذَا الْمَالِ شَىْءٌ، وَأَنْتَ غَيْرُ مُشْرِفٍ وَلاَ سَائِلٍ، فَخُذْهُ، وَمَا لاَ فَلاَ تُتْبِعْهُ نَفْسَكَ». [رواه البخاري: ١٤٧٣]

**751.** Rəvayət edilir ki, Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ (qənimətdən) mənə pay verər, mən də (ona): "Bunu məndən də çox ehtiyacı olanlara ver"– deyərdim. (Bir dəfə o mənə) dedi: "Götür bunu! Əgər sənin canfəşanlığın və istəyin olmadan bu (dünya) malı sənə verilərsə, onu götür. Verilməsə, onun dalınca düşmə." (əl-Buxari, 1473)

## ٣٦- باب: مَنْ سَأَلَ النَّاسَ تَكَثُّرًا

## 36-cı fəsil. Malını çoxaltmaq məqsədilə dilənən kimsə

٧٥٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «مَا يَزَالُ الرَّجُلُ يَسْأَلُ النَّاسَ حَتَّى يَأْتِىَ يَوْمَ الْقِيَامَةِ لَيْسَ فِى وَجْهِهِ مُزْعَةُ لَحْمٍ». وَقَالَ «إِنَّ الشَّمْسَ تَدْنُو يَوْمَ الْقِيَامَةِ حَتَّى يَبْلُغَ الْعَرَقُ نِصْفَ الأُذُنِ، فَبَيْنَا هُمْ كَذَلِكَ اسْتَغَاثُوا بِآدَمَ، ثُمَّ بِمُوسَى، ثُمَّ بِمُحَمَّدٍ». [رواه البخاري: ١٤٧٤-١٤٧٥]

**752.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Birisi o qədər dilənəcək ki, nəhayət, Qiyamət günü üzündə heç bir ət parçası olmadan (məhşərə) gələcək."

(Peyğəmbər ﷺ həmçinin) demişdir: "Qiyamət günü günəş (insanlara) o qədər yaxınlaşacaq ki, axırda (insanlardan axan) tər qulaqlarının, ortasına çatacaq. Onlar belə bir (çətin) vəziyyətə düşdükdə (əvvəlcə) Adəmdən, sonra Musadan, sonra da Muhəmməddən kömək diləyəcəklər." (əl-Buxari, 1474-1475)

## 37-ci fəsil. Varlı olmağın həddi

## ٣٧– باب: حَدُّ الغِنى

٧٥٣ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لَيْسَ الْمِسْكِينُ الَّذى يَطُوفُ عَلَى النَّاسِ تَرُدُّهُ اللُّقْمَةُ وَاللُّقْمَتَان وَالتَّمْرَةُ وَالتَّمْرَتَان، وَلَكِنِ الْمِسْكِينُ الَّذِى لاَ يَجِدُ غِنًى يُغْنِيه، وَلاَ يُفْطَنُ بِهِ فَيُتَصَدَّقُ عَلَيْه، وَلاَ يَقُومُ فَيَسْأَلُ النَّاسَ». [رواه البخاري: ١٤٧٩]

**753.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar arasında gəzib-dolaşıb bir-iki loxma və ya bir-iki xurma ilə kifayətlənən adam heç də yoxsul deyil. Yoxsul o adamdır ki, onun özünə bəs edəcək qədər malı yoxdur, vəziyyətinin ağır olduğunu heç kəsə bildirmir və buna görə də ona sədəqə verilmir, özü də insanlardan heç bir şey istəmir." (əl-Buxari, 1479)

## 38-ci fəsil. Xurma budaqda ikən onun miqdarını təxmin etmək

## ٣٨– باب: خَرْصُ التَّمْرِ

٧٥٤ – عَنْ أَبِى حُمَيْد السَّاعدىِّ ﷺ قَالَ غَزَوْنَا مَعَ النَّبِىِّ ﷺ غَزْوَةَ تَبُوكَ فَلَمَّا جَاءَ وَادِىَ الْقُرَى إذَا امْرَأَةٌ فِى حَدِيقَة لَهَا فَقَالَ النَّبِىُّ ﷺ لأَصْحَابه: «اخْرُصُوا». وَخَرَصَ رَسُولُ اللَّه ﷺ عَشَرَةَ أَوْسُق فَقَالَ لَهَا: «أَحْصى مَا يَخْرُجُ منْهَا». فَلَمَّا أَتَيْنَا تَبُوكَ قَالَ: «أَمَا إِنَّهَا سَتَهُبُّ اللَّيْلَةَ رِيحٌ شَدِيدَةٌ فَلاَ يَقُومَنَّ أَحَدٌ، وَمَنْ كَانَ مَعَهُ بَعِيرٌ فَلْيَعْقِلْهُ». فَعَقَلْنَاهَا وَهَبَّتْ رِيحٌ شَدِيدَةٌ فَقَامَ رَجُلٌ فَأَلْقَتْهُ بِجَبَلِ طَيِّئٍ – وَأَهْدَى مَلكُ أَيْلَةَ لِلنَّبِىِّ ﷺ بَغْلَةً بَيْضَاءَ، وَكَسَاهُ بُرْدًا وَكَتَبَ لَهُ بِبَحْرِهِمْ – فَلَمَّا أَتَى وَادِىَ الْقُرَى قَالَ لِلْمَرْأَة «كَمْ جَاءَ حَدِيقَتُك». قَالَتْ عَشَرَةَ أَوْسُق خَرْصَ رَسُول اللَّه ﷺ فَقَالَ النَّبِىُّ ﷺ: «إِنِّى مُتَعَجِّلٌ إِلَى الْمَدِينَة، فَمَنْ أَرَادَ مِنْكُمْ أَنْ يَتَعَجَّلَ مَعى فَلْيَتَعَجَّلْ». فَلَمَّا أَشْرَفَ عَلَى الْمَدِينَة قَالَ: «هَذِه طَابَةُ». فَلَمَّا رَأَى أُحُدًا قَالَ: «هَذَا جُبَيْلٌ يُحِبُّنَا وَنُحِبُّهُ، أَلاَ أُخْبِرُكُمْ بِخَيْرِ دُورِ الأَنْصَارِ». قَالُوا بَلَى. قَالَ: «دُورُ بَنِى النَّجَّارِ، ثُمَّ دُورُ بَنِى عَبْدِ الأَشْهَلِ، ثُمَّ دُورُ بَنِى سَاعِدَةَ، أَوْ دُورُ بَنِى الْحَارِثِ بْنِ الْخَزْرَجِ، وَفِى كُلِّ دُورِ الأَنْصَارِ – يَعْنِى – خَيْرًا». [رواه البخاري: ١٤٨١]

**754.** Rəvayət edilir ki, Əbu Humeyd əs-Saidi ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Təbuk[1] döyüşündə iştirak etdik. Vad əl-Qura[2] deyilən yerə gəlib çatdıqda öz bağında olan bir qadına rast gəldik. Peyğəmbər ﷺ əshabələrinə: "(Ağacların üstündə təxminən nə qədər xurma olduğunu) təyin edin!"– deyə buyurdu. Beləliklə, Peyğəmbər ﷺ (orada) on vəsq[3] olduğunu təyin etdikdən sonra qadına dedi: "Bundan nə qədər (zəkat) çıxaracağını hesabla." Biz Təbuka gəlib çatdıqda Peyğəmbər ﷺ: "Bu gecə bərk külək əsəcək. Odur ki, heç kəs yerindən qalxmasın, kimin dəvəsi varsa, qoy onu buxovlasın"– dedi. Biz dəvələrimizi buxovladıq. (O gecə) bərk külək əsdi. (Bu vaxt) bir nəfər ayağa qalxdı və külək onu götürüb Tay dağına atdı.

Sonra Əylə hökmdarı[4] Peyğəmbərə ﷺ bir ağ qatır və bir bürüncək hədiyyə etdi. O da ona dənizin sahilində yaşayan əhalisi üçün (sülh müqaviləsi) yazıb göndərdi.

---

[1] Təbuk Mədinədən 250 mil aralı, Ərəb körfəzinin yaxınlığında yerləşən şəhərdir.
[2] Vadi əl-Qura Mədinə ilə Şam sərhədləri arasında yerləşən qədimi bir kənddir.
[3] 708-ci hədisin qeydlərinə bax.
[4] Burada söhbət Peyğəmbərlə ﷺ sülh müqaviləsi bağlamış Yuhanna ibn Robədən gedir.

(Peyğəmbər ﷺ geri qayıdarkən) Vad əl-Quraya gəlib çatdıqda (həmin) qadından: "Bağın nə qədər məhsul verdi?"– deyə soruşdu. Qadın: "On vəsq"– deyə cavab verdi. Peyğəmbərin ﷺ təxmin etdiyi (doğru çıxdı). Sonra Peyğəmbər ﷺ buyurdu: "Mən Mədinəyə tələsirəm. Mənimlə getmək istəyən varsa, qoy tələssin"[1]. Peyğəmbər ﷺ Mədinəyə gəlib çatdıqda: "Bu, Tabədir!"[2]– dedi. Uhud dağını gördükdə isə dedi: "Bu balaca dağ bizi sevir, biz də onu sevirik. Sizə ənsarın ən xeyirliləri barədə xəbər verimmi?" (Əshabələr): "Bəli"– deyəndə, o buyurdu: "Bəni-Nəccar, sonra Bəni-Abdul-Əşhəl, sonra Bəni-Səadə, sonra da Bəni-əl-Haris ibn əl-Xəzrəc qəbiləsidir. Ənsardan olan hər bir qəbilədə xeyir vardır." (əl-Buxari, 1481)

## ٣٩– باب: الْعُشْرُ فِيمَا يُسْقَى مِنْ مَاءِ السَّمَاءِ وَبِالْمَاءِ الْجَارِى

## 39-cu fəsil. Yağmurla və axar su ilə sulanmış[3] torpaqdan götürülən məhsulun onda biri (zəkat verilməlidir)

٧٥٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما عَنِ النَّبِيِّ ﷺ قَالَ: «فِيمَا سَقَتِ السَّمَاءُ وَالْعُيُونُ أَوْ كَانَ عَثَرِيًّا الْعُشْرُ، وَمَا سُقِىَ بِالنَّضْحِ نِصْفُ الْعُشْرِ». [رواه البخاري: ١٤٨٣]

**755.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yağmurla, bulaq suyu ilə sulanmış və ya dibinə su tökülmədən kökündən su içən (bitkilərdən yığılan) məhsulun onda biri (zəkat verilməlidir). Süni yolla suvarılan (ərazilərdən götürülmüş) məhsulun isə onda birinin yarısı (zəkat verilməlidir)." (əl-Buxari, 1483)

## ٤٠– باب: أَخْذُ صَدَقَةِ التَّمْرِ عِنْدَ صِرَامِ النَّخْلِ وَهَلْ يُتْرَكُ الصَّبِىُّ فَيَمَسَّ تَمْرَ الصَّدَقَةِ

## 40-cı fəsil. Xurmanın zəkatı məhsul yığımı vaxtı götürülməlidir; uşaq sədəqə üçün ayrılmış xurmaya toxuna bilərmi?

٧٥٦ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُؤْتَى بِالتَّمْرِ عِنْدَ صِرَامِ النَّخْلِ فَيَجِىءُ هَذَا بِتَمْرِهِ وَهَذَا مِنْ تَمْرِهِ حَتَّى يَصِيرَ عِنْدَهُ كَوْمًا مِنْ تَمْرٍ، فَجَعَلَ الْحَسَنُ وَالْحُسَيْنُ رضي الله عنهما يَلْعَبَانِ بِذَلِكَ التَّمْرِ، فَأَخَذَ أَحَدُهُمَا تَمْرَةً، فَجَعَلَهَا فِى فِيهِ، فَنَظَرَ إِلَيْهِ رَسُولُ اللَّهِ ﷺ فَأَخْرَجَهَا مِنْ فِيهِ فَقَالَ: «أَمَا عَلِمْتَ أَنَّ آلَ مُحَمَّدٍ ﷺ لاَ يَأْكُلُونَ الصَّدَقَةَ». [رواه البخاري: ١٤٨٥]

**756.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Məhsul yığımı zamanı Peyğəmbərə ﷺ xurma gətirərdilər. Bəziləri onu özü gətirər, bəziləri də (başqa birisi ilə) göndərərdi. (Bu ta o vaxta qədər davam edərdi ki,) axırda onun yanında bir topa xurma yığılardı. (Bir dəfə Peyğəmbərin ﷺ nəvələri) Həsən və Hüseyn رضي الله عنهما həmin xurmalarla oynamağa başladılar. Onlardan biri xurmalardan birini götürüb ağzına qoydu. Peyğəmbər ﷺ ona baxıb xurmanı onun ağzından çıxart-

---

[1] Buxarinin şeyxi ibn Bəkkar Peyğəmbərin ﷺ buna bənzər bir söz söylədiyini rəvayət etmişdir.

[2] Tabə – Mədinə şəhərinin adlarından biri. Tabə ərəbcə gözəl, qəşəng deməkdir.

[3] Burada insan əməyi sərf edilmədən suvarılan torpaq nəzərdə tutulur.

dı və dedi: "Məgər bilmirsənmi ki, Muhəmməd ﷺ ailəsi[1] sədəqə yemir?!" (əl-Buxari, 1485)

## 41-ci fəsil. (Adam) verdiyi sədəqəni satın ala bilərmi? Onun verdiyi sədəqəni başqa birisi də satın ala bilər

## ٤١– باب: هَلْ يَشْتَرِى صَدَقَتَهُ، وَلاَ بَأْسَ أَنْ يَشْتَرِىَ صَدَقَتَهُ غَيْرُهُ

٧٥٧ – عَنْ عُمَرَ رضي الله عنه قَالَ حَمَلْتُ عَلَى فَرَسٍ فِى سَبِيلِ اللَّه، فَأَضَاعَهُ الَّذِى كَانَ عِنْدَهُ، فَأَرَدْتُ أَنْ أَشْتَرِيَهُ، وَظَنَنْتُ أَنَّهُ يَبِيعُهُ بِرُخْصٍ، فَسَأَلْتُ النَّبِىَّ ﷺ فَقَالَ: «لاَ تَشْتَرِ وَلاَ تَعُدْ فِى صَدَقَتِكَ، وَإِنْ أَعْطَاكَهُ بِدِرْهَمٍ، فَإِنَّ الْعَائِدَ فِى صَدَقَتِهِ كَالْعَائِدِ فِى قَيْئِهِ». [رواه البخاري: ١٤٩٠]

**757.** Rəvayət edilir ki, Ömər ﷺ demişdir: "Mən bir nəfərə Allah yolunda (vuruşsun deyə) at bağışladım. Lakin o, lazımınca atın qayğısına qalmadı. Onda mən atımı satın almaq istədim və elə güman etdim ki, o bunu mənə ucuz qiymətə satar. Bu haqda Peyğəmbərdən ﷺ soruşduqda o (mənə) dedi: "Onu sənə bir dirhəmə versə belə, nə (onu) satın al, nə də verdiyin sədəqəni geri götür. Çünki verdiyi sədəqəni geri götürən adam, qusduğunu yeyən adama bənzəyir." (əl-Buxari, 1490)

## 42-ci fəsil. Peyğəmbərin zövcələrinin azad etdiyi kölələrə zəkat vermək

## ٤٢– باب: الصَّدَقَةِ عَلَى مَوَالِى أَزْوَاجِ النَّبِىِّ ﷺ

٧٥٨ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: وَجَدَ النَّبِىُّ ﷺ شَاةً مَيِّتَةً أُعْطِيَتْهَا مَوْلاَةٌ لِمَيْمُونَةَ مِنَ الصَّدَقَةِ، قَالَ النَّبِىُّ ﷺ: «هَلاَّ انْتَفَعْتُمْ بِجِلْدِهَا». قَالُوا إِنَّهَا مَيْتَةٌ. قَالَ: «إِنَّمَا حَرُمَ أَكْلُهَا». [رواه البخاري: ١٤٩٢]

**758.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Meymunənin kənizinə sədəqə olaraq verilmiş qoyunun öldüyünü görüb dedi: "Nə üçün bu qoyunun dərisini (aşılayıb ondan) istifadə etmirsiniz?" Onlar: "Axı o, murdar olub!"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "Murdar olmuş heyvanın yalnız yeyilməsi haram edilmişdir." (əl-Buxari, 1492)

## 43-cü fəsil. Sədəqənin dəyişməsi

## ٤٣– باب: إِذَا تَحَوَّلَتِ الصَّدَقَةُ

٧٥٩ – عَنْ أَنَسٍ رضي الله عنه أَنَّ النَّبِىَّ ﷺ أُتِىَ بِلَحْمٍ تُصُدِّقَ بِهِ عَلَى بَرِيرَةَ رضي الله عنها فَقَالَ: «هُوَ عَلَيْهَا صَدَقَةٌ، وَهُوَ لَنَا هَدِيَّةٌ». [رواه البخاري: ١٤٩٥]

**759.** Ənəs ﷺ rəvayət edir ki, Bərirəyə sədəqə olaraq verilmiş qoyun ətini Peyğəmbərə ﷺ gətirdilər. (Belə olduğu halda) Peyğəmbər ﷺ buyurdu: "Bu (ət) onun üçün sədəqə, bizim üçün isə hədiyyədir." (əl-Buxari, 1495)

[1] Burada Peyğəmbərin ﷺ ailəsi deyildikdə haşimilər nəzərdə tutulur.

## ٤٤- باب: أَخْذُ الصَّدَقَة مِنَ الأَغْنِيَاءِ وَتُرَدَّ فِى الْفُقَرَاءِ حَيْثُ كَانُوا

## 44-cü fəsil. Zəkatın varlılardan alınıb həmin yerdə yaşayan kasıblara verilməsi

٧٦٠ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ لمُعَاذ بْنِ جَبَلٍ رضي الله عنه حينَ بَعَثَهُ إِلَى الْيَمَنِ: «إِنَّكَ سَتَأْتِى قَوْمًا أَهْلَ كتَاب، فَإِذَا جِئْتَهُمْ فَادْعُهُمْ إِلَى أَنْ يَشْهَدُوا أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا رَسُولُ اللَّه، فَإِنْ هُمْ أَطَاعُوا لَكَ بذَلكَ، فَأَخْبِرْهُمْ أَنَّ اللَّهَ قَدْ فَرَضَ عَلَيْهِمْ خَمْسَ صَلَوَات فى كُلِّ يَوْمٍ وَلَيْلَة، فَإِنْ هُمْ أَطَاعُوا لَكَ بذَلكَ فَأَخْبِرْهُمْ أَنَّ اللَّهَ قَدْ فَرَضَ عَلَيْهِمْ صَدَقَةً تُؤْخَذُ منْ أَغْنِيَائهِمْ فَتُرَدُّ عَلَى فُقَرَائهِمْ، فَإِنْ هُمْ أَطَاعُوا لَكَ بذَلكَ فَإِيَّاكَ وَكَرَائمَ أَمْوَالهِمْ، وَاتَّقِ دَعْوَةَ الْمَظْلُومِ، فَإِنَّهُ لَيْسَ بَيْنَهُ وَبَيْنَ اللَّه حجَابٌ». [رواه البخاري: ١٤٩٦]

**760.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Muaz ibn Cəbəli Yəmənə göndərərkən demişdir: "Sən Kitab əhlindən olan bir qövmün yanına gedirsən. Onların yanına vardığın zaman onları Allahdan başqa (ibadətə haqqı olan) məbudun olmadığına və Muhəmmədin Onun elçisi olduğuna şəhadət verməyə dəvət et. Əgər bu işdə sənə itaət etsələr, onlara xəbər ver ki, Allah onlara gündəlik olaraq beş vaxt namaz qılmağı vacib buyurmuşdur. Əgər bu işdə sənə itaət etsələr, onları xəbərdar et ki, Allah onlara zəkat verməyi – dövlətlilərindən götürülüb kasıblara verilməsini vacib buyurmuşdur. Əgər bu işdə də sənə itaət etsələr, onda onların mallarının ən qiymətlisini götürməkdən çəkin və məzlumun bədduasından qorx. Çünki onunla Allah arasında (bu bədduanın qarşısını ala biləcək) heç bir pərdə yoxdur." (əl-Buxari, 1496)

## ٤٥- باب: صَلاَةُ الإِمَامِ وَدُعَائه لِصَاحِبِ الصَّدَقَة

## 45-ci fəsil. İmamın zəkat verən adam üçün dua etməsi

٧٦١ – عَنْ عَبْد اللَّه بْنِ أَبِى أَوْفَى رضي الله عنه قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا أَتَاهُ قَوْمٌ بِصَدَقَتِهِمْ قَالَ: «اللَّهُمَّ صَلِّ عَلَى آلِ فُلاَنٍ». فَأَتَاهُ أَبِى بِصَدَقَتِه، فَقَالَ: «اللَّهُمَّ صَلِّ عَلَى آلِ أَبِى أَوْفَى». [رواه البخاري: ١٤٩٧]

**761.** Rəvayət edilir ki, Abdullah ibn Əbu Əufə رضي الله عنه demişdir: "Birisi Peyğəmbərə ﷺ sədəqə gətirəndə, (Peyğəmbər ﷺ onun üçün dua edib) deyərdi: "Allahım, filankəsin ailəsinə xeyir-dua ver!" Atam Peyğəmbərə ﷺ sədəqə gətirdikdə, o buyurdu: "Allahım, Əbu Əufənin ailəsinə xeyir-dua ver!" (əl-Buxari, 1497)

## ٤٦- باب: مَا يُسْتَخْرَجُ مِنَ الْبَحْرِ

## 46-cı fəsil. Dənizdən çıxarılanlar

٧٦٢ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ: «أَنَّ رَجُلاً منْ بَنِى إِسْرَائِيلَ سَأَلَ بَعْضَ بَنِى إِسْرَائِيلَ بِأَنْ يُسْلِفَهُ أَلْفَ دِينَارٍ، فَدَفَعَهَا إِلَيْه، فَخَرَجَ فِى الْبَحْرِ، فَلَمْ يَجِدْ مَرْكَبًا، فَأَخَذَ خَشَبَةً فَنَقَرَهَا فَأَدْخَلَ فِيهَا أَلْفَ دِينَارٍ، فَرَمَى بِهَا فِى الْبَحْرِ، فَخَرَجَ الرَّجُلُ الَّذِى كَانَ أَسْلَفَهُ، فَإِذَا بِالْخَشَبَةِ فَأَخَذَهَا لأَهْلِه حَطَبًا – فَذَكَرَ الْحَدِيثَ – فَلَمَّا نَشَرَهَا وَجَدَ الْمَالَ». [رواه البخاري: ١٤٩٨]

**762.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İsrail oğullarından birisi bir başqasından min dinar borc pul istədi. O da ona (bu pulu) verdi. (Borcu qaytarmaq vaxtı gəlib çatdıqda) həmin adam dənizin sahilinə gəldi, lakin

bir gəmi tapa bilmədi (ki, pulu borclu olduğu adama göndərsin). Belə olduqda o, bir ağac parçası götürüb onun içini oydu və min dinarı (oyuğa) doldurub dənizə atdı. Borc verən adam (verdiyi borcu almaq üçün) dənizin sahilinə çıxdı. Birdən həmin ağac parçasını gördü və onu götürüb odun kimi istifadə etmək məqsədi ilə evinə apardı. (Peyğəmbər ﷺ hədisin tamamında buyurdu:) Həmin adam odunu mişarladıqda içindən (ona çatacaq) pulları tapdı." (əl-Buxari, 1498)

## 47-ci fəsil. Tapılmış xəzinənin beşdə birini zəkat vermək

## ٤٧– باب: فِى الرِّكَازِ الْخُمُسُ

٧٦٣ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «الْعَجْمَاءُ جُبَارٌ، وَالْبِئْرُ جُبَارٌ، وَالْمَعْدِنُ جُبَارٌ، وَفِى الرِّكَازِ الْخُمُسُ». [رواه البخاري: ١٤٩٩]

**763.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heyvanın vurduğu zərərin, habelə quyuya düşmüş və ya mədəndə (qəzaya uğramış) kimsəyə (dəymiş) zərərin əvəzi ödənilmir. Tapılmış xəzinənin isə beşdə biri (zəkat verilməlidir)." (əl-Buxari, 1499)

## 48-ci fəsil. Allahın: "...onu yığıb paylayanlara..." sözü[1] və zəkatı paylayanların imama hesabat verməsi

## ٤٨– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَٱلْعَـٰمِلِينَ عَلَيْهَا﴾ وَمُحَاسَبَةِ الْمُصَدِّقِينَ مَعَ الإِمَامِ

٧٦٤ – عَنْ أَبِى حُمَيْدٍ السَّاعِدِىِّ رضي الله عنه قَالَ: اسْتَعْمَلَ رَسُولُ اللَّهِ ﷺ رَجُلاً مِنَ الأَسْدِ عَلَى صَدَقَاتِ بَنِى سُلَيْمٍ يُدْعَى ابْنَ اللُّتْبِيَّةِ، فَلَمَّا جَاءَ حَاسَبَهُ. [رواه البخاري: ١٥٠٠]

**764.** Rəvayət edilir ki, Əbu Humeyd əs-Saidi رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ Bəni-Suleym qəbiləsinin zəkatını yığmağı Əsəd qəbiləsindən olan ibn Lütbiyyə adlı bir nəfərə tapşırdı. Bu adam geri qayıtdıqda Peyğəmbər ﷺ ondan hesabat verməyi tələb etdi." (əl-Buxari, 1500)

## 49-cu fəsil. İmamın zəkat üçün ayrılmış dəvələrə damğa vurması

## ٤٩– باب: وَسْمُ الإِمَامِ إِبِلَ الصَّدَقَةِ بِيَدِهِ

٧٦٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: غَدَوْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ بِعَبْدِ اللَّهِ بْنِ أَبِى طَلْحَةَ لِيُحَنِّكَهُ، فَوَافَيْتُهُ فِى يَدِهِ الْمِيسَمُ يَسِمُ إِبِلَ الصَّدَقَةِ. [رواه البخاري: ١٥٠٢]

**765.** Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه demişdir: "Mən Abdullah ibn Əbu Təlhəni Peyğəmbərin ﷺ yanına gətirdim ki, o, xurmanı ağzında əzib körpənin ağzına qoysun[2]. Mən (Peyğəmbərin ﷺ yanına gəldikdə) onun damğavuran alətlə zəkat üçün ayrılmış dəvələri damğaladığını gördüm." (əl-Buxari, 1502)

---

[1] "ət-Tovbə" surəsi, 60.
[2] Buna ərəbcə "təhnik" deyilir.

# ٢٥ – كِتَابُ صَدَقَةُ الفِطْرِ

# 25 – Fitrə zəkatı kitabı

## ١– باب: فَرْضُ صَدَقَةِ الْفِطْرِ

## 1-ci fəsil. Fitrə zəkatının vacibliyi

٧٦٦ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: فَرَضَ رَسُولُ اللَّهِ ﷺ زَكَاةَ الْفِطْرِ صَاعًا مِنْ تَمْرٍ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ عَلَى الْعَبْدِ وَالْحُرِّ، وَالذَّكَرِ وَالأُنْثَى، وَالصَّغِيرِ وَالْكَبِيرِ مِنَ الْمُسْلِمِينَ، وَأَمَرَ بِهَا أَنْ تُؤَدَّى قَبْلَ خُرُوجِ النَّاسِ إِلَى الصَّلاَةِ. [رواه البخاري: ١٥٠٣]

**766.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ (Ramazan bayramında) fitrə zəkatı olaraq müsəlmanlardan köləyə və azad insana, kişiyə və qadına, kiçiyə və böyüyə bir saa[1] xurma və ya bir saa arpa verməyi vacib buyurmuşdur. Peyğəmbər ﷺ fitrə zəkatını, camaat (bayram) namazına çıxmamışdan əvvəl verməyi əmr etmişdir." (əl-Buxari, 1503)

## ٢– باب: الصَّدَقَةُ قَبْلَ الْعِيدِ

## 2-ci fəsil. Fitrə zəkatının bayramdan qabaq verilməsi

٧٦٧ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ رضي الله عنه قَالَ كُنَّا نُخْرِجُ فِي عَهْدِ رَسُولِ اللَّهِ ﷺ يَوْمَ الْفِطْرِ صَاعًا مِنْ طَعَامٍ. وَقَالَ أَبُو سَعِيدٍ رضي الله عنه وَكَانَ طَعَامَنَا الشَّعِيرُ وَالزَّبِيبُ وَالأَقِطُ وَالتَّمْرُ. [رواه البخاري: ١٥١٠]

**767.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri رضي الله عنه demişdir: "Biz Peyğəmbərin ﷺ dövründə ramazan bayramında (kasıblara) bir saa yemək zəkat verərdik. O vaxt bizim yediyimiz arpa, kişmiş, qurut[2] və xurma idi." (əl-Buxari, 1510)

## ٣– باب: صَدَقَةُ الْفِطْرِ عَلَى الْحُرِّ وَالْمَمْلُوكِ

## 3-cü fəsil. Fitrə zəkatının istər azad insanlara, istərsə də kölələrə verilməsi

٧٦٨ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: فَرَضَ رَسُولُ اللَّهِ ﷺ صَدَقَةَ الْفِطْرِ صَاعًا مِنْ شَعِيرٍ، أَوْ صَاعًا مِنْ تَمْرٍ عَلَى الصَّغِيرِ وَالْكَبِيرِ وَالْحُرِّ وَالْمَمْلُوكِ. [رواه البخاري: ١٥١٢]

**768.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ fitrə zəkatı olaraq kiçiyə və böyüyə, azad insana və köləyə bir saa arpa və ya bir saa xurma verməyi vacib buyurmuşdur." (əl-Buxari, 1512)

---

[1] 152-ci hədisin qeydlərinə bax.

[2] Yumru-yumru edilib qurudulmuş şor, süzmə.

# ٢٦ – كِتَابُ الحَجِ

# 26 – Həcc kitabı

## ١ – باب: وُجُوبُ الْحَجِّ وَفَضْلُهُ

## 1-ci fəsil. Həccin vacib olması və onun fəziləti

٧٦٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ كَانَ الْفَضْلُ رَدِيفَ رَسُولِ اللَّهِ ﷺ فَجَاءَتِ امْرَأَةٌ مِنْ خَثْعَمَ، فَجَعَلَ الْفَضْلُ يَنْظُرُ إِلَيْهَا وَتَنْظُرُ إِلَيْهِ، وَجَعَلَ النَّبِيُّ ﷺ يَصْرِفُ وَجْهَ الْفَضْلِ إِلَى الشِّقِّ الآخَرِ فَقَالَتْ يَا رَسُولَ اللَّهِ إِنَّ فَرِيضَةَ اللَّهِ عَلَى عِبَادِهِ فِي الْحَجِّ أَدْرَكَتْ أَبِي شَيْخًا كَبِيرًا، لاَ يَثْبُتُ عَلَى الرَّاحِلَةِ، أَفَأَحُجُّ عَنْهُ قَالَ: «نَعَمْ». وَذَلِكَ فِي حَجَّةِ الْوَدَاعِ. [رواه البخاري: ١٥١٣]

**769.** Rəvayət edilir ki, Abdullah ibn Abbas ﷺ demişdir: "Fədl[1] Peyğəmbərin ﷺ tərkinə minmişdi. Bu əsnada Xəsəm qəbiləsindən bir qadın (onların yanına) gəldi. Fədl o qadına, o da Fədlə baxmağa başladı. Belə olduqda Peyğəmbər ﷺ Fədlin üzünü başqa tərəfə çevirdi. Qadın dedi: "Ya Rəsulullah! Allah Öz qullarına həcc ziyarətini elə bir vaxtda vacib buyurmuşdur ki, (artıq) atam qocalmış və minik üzərində oturmağa halı qalmamışdır. Belə olduqda, mən onun əvəzinə həcc edə bilərəmmi?" Peyğəmbər ﷺ: "Bəli!"– deyə buyurdu. Bu hadisə vida həccində baş vermişdir. (əl-Buxari, 1513)

## ٢ – باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿يَأْتُوكَ رِجَالًا وَعَلَىٰ كُلِّ ضَامِرٍ يَأْتِينَ مِن كُلِّ فَجٍّ عَمِيقٍ ﴿٢٧﴾ لِّيَشْهَدُوا مَنَافِعَ لَهُمْ﴾

## 2-ci fəsil. Uca Allahın: «...onlar sənin yanına piyada və ya hər biri uzaq yoldan gələn qayışbaldır dəvələr üstündə gəlsinlər. Qoy onlar öz mənfəətlərinin şahidi olsunlar...»[2] sözü

٧٧٠ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَرْكَبُ رَاحِلَتَهُ بِذِي الْحُلَيْفَةِ ثُمَّ يُهِلُّ حَتَّى تَسْتَوِيَ بِهِ قَائِمَةً. [رواه البخاري: ١٥١٤]

**770.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ zül-Hüleyfədə[3] dəvəsinə mindiyini və dəvəsi ayağa qalxdıqdan sonra (niyyət edib) ihrama girdiyini gördüm." (əl-Buxari, 1514)

## ٣– باب: الْحَجُّ عَلَى الرَّحْلِ

## 3-cü fəsil. Minik üzərində həcc ziyarətini yerinə yetirmək

٧٧١ – عَنْ أَنَسٍ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ حَجَّ عَلَى رَحْلٍ وَكَانَتْ زَامِلَتَهُ. [رواه البخاري: ١٥١٧]

---

[1] Bu, Abdullah ibn Abbasın ﷺ qardaşı Fədldir ﷺ.
[2] "əl-Həcc" surəsi, 27-28.
[3] Mədinə şəhərinin on kilometrliyində yerləşən yer.

**771.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (həcc boyu onun) yükünü daşıyan dəvəsinin üstündə həcc ziyarətini yerinə yetirdi." (əl-Buxari, 1517)

## 4-cü fəsil. Qəbul olunmuş həccin üstünlüyü

## ٤ – باب: فَضْلُ الْحَجِّ الْمَبْرُورِ

٧٧٢ – عَنْ عَائِشَةَ أُمِّ الْمُؤْمِنِينَ رضي الله عنها أَنَّهَا قَالَتْ يَا رَسُولَ اللَّهِ، نَرَى الْجِهَادَ أَفْضَلَ الْعَمَلِ، أَفَلاَ نُجَاهِدُ قَالَ: «لاَ، لَكِنَّ أَفْضَلَ الْجِهَادِ حَجٌّ مَبْرُورٌ». [رواه البخاري: ١٥٢٠]

**772.** Rəvayət edilir ki, möminlərin anası Aişə رضي الله عنها demişdir: "Ya Rəsulullah, biz cihadın ən əfzəl əməllərdən olduğunu güman edirik. Elə isə biz cihadda iştirak edə bilərikmi?" Peyğəmbər ﷺ buyurdu: "Xeyr! (Siz qadınlar üçün) ən əfzəl cihad qəbul olunmuş həccdir!" (əl-Buxari, 1521)

٧٧٣ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «مَنْ حَجَّ لِلَّهِ فَلَمْ يَرْفُثْ وَلَمْ يَفْسُقْ رَجَعَ كَيَوْمِ وَلَدَتْهُ أُمُّهُ». [رواه البخاري: ١٥٢١]

**773.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim Allah xatirinə həcc ziyarətini yerinə yetirsə, (ziyarət əsnasında) qadını ilə yaxınlıq etməsə və (digər) günah işlərdən çəkinsə, dünyaya gəldiyi gündə olduğu kimi (pak halda evinə) qayıdar." (əl-Buxari, 1521)

## 5-ci fəsil. Məkkə sakinlərinin həcc və ümrə ziyarətləri üçün ihrama girdikləri yer

## ٥ – باب: مُهَلُّ أَهْلِ مَكَّةَ لِلْحَجِّ وَالْعُمْرَةِ

٧٧٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: إِنَّ النَّبِيَّ ﷺ وَقَّتَ لأَهْلِ الْمَدِينَةِ ذَا الْحُلَيْفَةِ، وَلأَهْلِ الشَّأْمِ الْجُحْفَةَ، وَلأَهْلِ نَجْدٍ قَرْنَ الْمَنَازِلِ، وَلأَهْلِ الْيَمَنِ يَلَمْلَمَ، هُنَّ لَهُنَّ وَلِمَنْ أَتَى عَلَيْهِنَّ مِنْ غَيْرِهِنَّ، مِمَّنْ أَرَادَ الْحَجَّ وَالْعُمْرَةَ، وَمَنْ كَانَ دُونَ ذَلِكَ فَمِنْ حَيْثُ أَنْشَأَ، حَتَّى أَهْلُ مَكَّةَ مِنْ مَكَّةَ. [رواه البخاري: ١٥٢٤]

**774.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Mədinə əhli üçün zül-Hüleyfəni, Şam əhli üçün Cühfəni, Nəcd əhli üçün Qərnəl-Mənazili və Yəmən əhli üçün Yələmləmi miqat[1] təyin etdi. Bu miqatlar həm onlar üçün, həm də başqa yerlərdən gəlib oradan keçərək həcc və ümrə ziyarətlərinə gələnlər üçündür. Miqat yerləri ilə Məkkə arasında olanlar isə istədikləri yerdən ihrama girə bilərlər. Məkkəlilər də Məkkədən ihrama girə bilərlər." (əl-Buxari, 1524)

## 6-cı fəsil

## ٦ – باب

٧٧٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَنَاخَ بِالْبَطْحَاءِ بِذِي الْحُلَيْفَةِ فَصَلَّى بِهَا. وَكَانَ عَبْدُ اللَّهِ بْنُ عُمَرَ رضي الله عنهما يَفْعَلُ ذَلِكَ. [رواه البخاري: ١٥٣٢]

---

[1] Həcc və ya ümrə ziyarətini yerinə yetirmək üçün niyyət edilən yer.

**775.** Abdullah ibn Ömər ﭬ rəvayət edir ki, Peyğəmbər ﷺ zül-Hüleyfədə düzəngah bir yerdə dəvəsini yerə çökdürdü və orada (iki rükət) namaz qıldı.
(Hədisi danışan ravi) demişdir: "Abdullah ibn Ömər ﭬ də belə edərdi." (əl-Buxari, 1532)

### 7-ci fəsil. Peyğəmbərin ﷺ (həccə gedərkən) Şəcərədən[1] keçməsi

### ٧– باب: خُرُوجُ النَّبِىِّ ﷺ عَلَى طَرِيقِ الشَّجَرَةِ

**٧٧٦ –** عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﭬ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَخْرُجُ مِنْ طَرِيقِ الشَّجَرَةِ، وَيَدْخُلُ مِنْ طَرِيقِ الْمُعَرَّسِ، وَأَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا خَرَجَ إِلَى مَكَّةَ يُصَلِّى فِى مَسْجِدِ الشَّجَرَةِ، وَإِذَا رَجَعَ صَلَّى بِذِى الْحُلَيْفَةِ بِبَطْنِ الْوَادِى، وَبَاتَ حَتَّى يُصْبِحَ. [رواه البخاري: ١٥٣٣]

**776.** Abdullah ibn Ömər ﭬ rəvayət edir ki, Peyğəmbər ﷺ (Məkkəyə gedərkən) Şəcərədən keçər, (geri qayıtdıqda isə Mədinəyə) Müərrəsdən[2] daxil olardı. Peyğəmbər ﷺ Məkkəyə gedərkən Şəcərədəki məsciddə namaz qılar, (Mədinəyə qayıdarkən isə) zül-Hüleyfədə düzəngah bir yerdə (iki rükət) namaz qılar və səhər açılanadək (orada) gecələyərdi." (əl-Buxari, 1533)

### 8-ci fəsil. Peyğəmbərin ﷺ: «Əqiq – mübarək bir vadidir» sözü

### ٨– باب: قَوْلُ النَّبِىِّ ﷺ: ﴿ الْعَقِيقُ وَادٍ مُبَارَكٌ ﴾

**٧٧٧ –** عَنْ عُمَرَ ﭬ قَالَ: سَمِعْتُ النَّبِىَّ ﷺ بِوَادِى الْعَقِيقِ يَقُولُ: «أَتَانِى اللَّيْلَةَ آتٍ مِنْ رَبِّى فَقَالَ صَلِّ فِى هَذَا الْوَادِى الْمُبَارَكِ وَقُلْ عُمْرَةً فِى حَجَّةٍ». [رواه البخاري: ١٥٣٤]

**777.** Rəvayət edilir ki, Ömər ﭬ demişdir: "Mən Peyğəmbərin ﷺ Əqiq vadisində belə dediyini eşitdim: "Bu gecə Rəbbimdən bir elçi mənim yanıma gəlib dedi: "Bu mübarək vadidə namaz qıl və: "Ümrətən fi həccətin" de![3]" (əl-Buxari, 1534)

**٧٧٨ –** عَنِ ابْنِ عُمَرَ ﭬ عَنِ النَّبِىِّ ﷺ أَنَّهُ رُئِىَ وَهُوَ فِى مُعَرَّسٍ بِذِى الْحُلَيْفَةِ بِبَطْنِ الْوَادِى قِيلَ لَهُ إِنَّكَ بِبَطْحَاءَ مُبَارَكَةٍ. [رواه البخاري: ١٥٣٥]

**778.** İbn Ömər ﭬ rəvayət edir ki, Peyğəmbər ﷺ zül-Hüleyfədəki vadidə dayanarkən yuxuda ona: "Sən mübarək vadidəsən"– deyilmişdir." (əl-Buxari, 1535)

### 9-cu fəsil. Ətrin qoxusunu aparmaq üçün paltarı üç dəfə yumaq

### ٩– باب: غَسْلُ الْخَلُوقِ ثَلاَثَ مَرَّاتٍ مِنَ الثِّيَابِ

**٧٧٩ –** عَنْ يَعْلَى بْنِ أُمَيَّةَ ﭬ قَالَ لِعُمَرَ ﭬ أَرِنِى النَّبِىَّ ﷺ حِينَ يُوحَى إِلَيْهِ قَالَ فَبَيْنَمَا النَّبِىُّ ﷺ بِالْجِعْرَانَةِ، وَمَعَهُ نَفَرٌ مِنْ أَصْحَابِهِ، جَاءَهُ رَجُلٌ فَقَالَ يَا رَسُولَ اللَّهِ كَيْفَ تَرَى فِى رَجُلٍ أَحْرَمَ بِعُمْرَةٍ، وَهُوَ مُتَضَمِّخٌ بِطِيبٍ فَسَكَتَ

---

[1] Mədinənin altı kilometrliyində yerləşən yer.
[2] Mədinənin altı kilometrliyində yerləşən yer.
[3] Yəni ümrə ilə bərabər həcc ziyarətini yerinə yetirməyi niyyət et. Burada həccin Qiran növü nəzərdə tutulur.

النَّبِيُّ ﷺ سَاعَةً فَجَاءَهُ الْوَحْيُ، فَأَشَارَ عُمَرُ ﷺ إِلَى يَعْلَى ﷺ، فَجَاءَ يَعْلَى ﷺ، وَعَلَى رَسُولِ اللَّهِ ﷺ ثَوْبٌ قَدْ أُظِلَّ بِهِ فَأَدْخَلَ رَأْسَهُ، فَإِذَا رَسُولُ اللَّهِ ﷺ مُحْمَرُّ الْوَجْهِ، وَهُوَ يَغِطُّ ثُمَّ سُرِّيَ عَنْهُ فَقَالَ: «أَيْنَ الَّذِي سَأَلَ عَنِ الْعُمْرَةِ» فَأُتِيَ بِرَجُلٍ فَقَالَ: «اغْسِلِ الطِّيبَ الَّذِي بِكَ ثَلَاثَ مَرَّاتٍ، وَانْزِعْ عَنْكَ الْجُبَّةَ، وَاصْنَعْ فِي عُمْرَتِكَ كَمَا تَصْنَعُ فِي حَجَّتِكَ». [رواه البخاري: ١٥٣٦]

**779.** Rəvayət edilir ki, Yə'lə ibn Ümeyyə ﷺ Ömərə ﷺ: "Peyğəmbərə ﷺ vəhy nazil olarkən mənə xəbər verərsən"– dedi. Peyğəmbər ﷺ bir dəstə əshabəsi ilə Ciranədə[1] olarkən bir nəfər onun yanına gəlib soruşdu: "Ya Rəsulullah, ümrə ziyarəti üçün niyyət edərkən ətirlənən adam barəsində nə deyə bilərsən?" Peyğəmbər ﷺ bir müddət susdu. Sonra ona vəhy nazil oldu. (Bu vaxt) Ömər Yə'ləyə işarə etdi və Yə'lə (Peyğəmbərin ﷺ yanına) gəldi. Peyğəmbər ﷺ (gündən qorunmaq üçün) başına örtük tutmuşdu. Yə'lə ﷺ əyilib Peyğəmbərə ﷺ baxdıqda gördü ki, onun üzü qızarıb, özü də xoruldayır. Sonra o ayıldı və: "Ümrə barəsində soruşan adam haradadır?"– deyə soruşdu. Həmin adamı Peyğəmbərin ﷺ yanına gətirdilər. Peyğəmbər ﷺ buyurdu: "(Bədənindəki) ətri üç dəfə yu, əynindəki cübbəni çıxart və həcc ziyarətində etdiklərini ümrə ziyarətində də et!" (əl-Buxari, 1536)

## ١٠ – باب: الطِّيبُ عِنْدَ الإِحْرَامِ وَمَا يَلْبَسُ إِذَا أَرَادَ أَنْ يُحْرِمَ

## 10-cu fəsil. İhrama girərkən ətir vurmaq. İhrama girmək istəyən adam nə geyinməlidir?

٧٨٠ – عَنْ عَائِشَةَ ﷺ زَوْجِ النَّبِيِّ ﷺ قَالَتْ كُنْتُ أُطَيِّبُ رَسُولَ اللَّهِ ﷺ لِإِحْرَامِهِ حِينَ يُحْرِمُ، وَلِحِلِّهِ قَبْلَ أَنْ يَطُوفَ بِالْبَيْتِ. [رواه البخاري: ١٥٣٩]

**780.** Rəvayət edilir ki, Peyğəmbərin zövcəsi ﷺ Aişə ﷺ demişdir: "Peyğəmbər ﷺ ihrama girməyə hazırlaşarkən, habelə ihramdan çıxarkən təvaf[2] etməmişdən qabaq mən ona ətir vurardım." (əl-Buxari, 1539)

## ١١ – باب: مَنْ أَهَلَّ مُلَبِّدًا

## 11-ci fəsil. İhrama girərkən saçlarını yapışqan bir maddə ilə yapışdıran[3] kimsə haqqında

٧٨١ – عَنِ ابْنِ عُمَرَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يُهِلُّ مُلَبِّدًا. [رواه البخاري: ١٥٤٠]

**781.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ saçlarının yapışqan bir maddə ilə yapışdırıldığı halda təlbiyə gətirdiyini eşitdim." (əl-Buxari, 1540)

---

[1] Məkkə ilə Taif arasında yerləşən vadi.

[2] Burada söhbət bayram günü – zülhiccənin 10-u yerinə yetirilən təvafdan gedir.

[3] Bunu ona görə edirdilər ki, uzun saçlar ziyarət edən adama maneə olmasın, habelə onu bit, birə, taxtabiti, gənə və başqa bu kimi həşəratlardan qorusun.

## ١٢– باب: الإِهْلاَلُ عِنْدَ مَسْجِدِ ذِى الْحُلَيْفَةِ

## 12-ci fəsil. Zülhüleyfə məscidində təlbiyə[1] gətirmək

٧٨٢ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: مَا أَهَلَّ رَسُولُ اللَّهِ ﷺ إِلاَّ مِنْ عِنْدِ الْمَسْجِدِ يَعْنِى مَسْجِدَ ذِى الْحُلَيْفَةِ. [رواه البخاري: ١٥٤١]

**782.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ ancaq zül-Hüleyfə məscidindən ihrama girərdi." (əl-Buxari, 1541)

## ١٣– باب: الرُّكُوبُ وَالارْتِدَافِ فِى الْحَجِّ

## 13-cü fəsil. Həccə gedərkən miniyə minmək, habelə birisini tərkinə almaq

٧٨٣ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ أُسَامَةَ رضي الله عنه كَانَ رِدْفَ النَّبِىِّ ﷺ مِنْ عَرَفَةَ إِلَى الْمُزْدَلِفَةِ، ثُمَّ أَرْدَفَ الْفَضْلَ مِنَ الْمُزْدَلِفَةِ إِلَى مِنًى. قَالَ فَكِلاَهُمَا قَالَ لَمْ يَزَلِ النَّبِىُّ ﷺ يُلَبِّى، حَتَّى رَمَى جَمْرَةَ الْعَقَبَةِ. [رواه البخاري: ١٥٤٣–١٥٤٤]

**783.** İbn Ömər رضي الله عنهما rəvayət etmişdir ki, Ərəfatdan Müzdəlifəyə qədər Üsamə, Müzdəlifədən Minaya qədər isə Fədl Peyğəmbərin ﷺ tərkinə minmişdi. Hər ikisi rəvayət etmişlər ki, Peyğəmbər ﷺ böyük sütuna[2] daş atanadək təlbiyə gətirmişdir." (əl-Buxari, 1543-1544)

## ١٤– باب: مَا يَلْبَسُ الْمُحْرِمُ مِنَ الثِّيَابِ وَالأَرْدِيَةِ وَالأُزُرِ

## 14-cü fəsil. İhrama girən adam nə cür geyim geyinməlidir?

٧٨٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: انْطَلَقَ النَّبِىُّ ﷺ مِنَ الْمَدِينَةِ، بَعْدَ مَا تَرَجَّلَ وَادَّهَنَ وَلَبِسَ إِزَارَهُ وَرِدَاءَهُ، هُوَ وَأَصْحَابُهُ، فَلَمْ يَنْهَ عَنْ شَىْءٍ مِنَ الأَرْدِيَةِ وَالأُزْرِ تُلْبَسُ إِلاَّ الْمُزَعْفَرَةَ الَّتِى تَرْدَعُ عَلَى الْجِلْدِ، فَأَصْبَحَ بِذِى الْحُلَيْفَةِ، رَكِبَ رَاحِلَتَهُ حَتَّى اسْتَوَى عَلَى الْبَيْدَاءِ، أَهَلَّ هُوَ وَأَصْحَابُهُ وَقَلَّدَ بَدَنَتَهُ، وَذَلِكَ لِخَمْسٍ بَقِينَ مِنْ ذِى الْقَعْدَةِ، فَقَدِمَ مَكَّةَ لأَرْبَعِ لَيَالٍ خَلَوْنَ مِنْ ذِى الْحِجَّةِ، فَطَافَ بِالْبَيْتِ وَسَعَى بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ، وَلَمْ يَحِلَّ مِنْ أَجْلِ بُدْنِهِ لأَنَّهُ قَلَّدَهَا، ثُمَّ نَزَلَ بِأَعْلَى مَكَّةَ عِنْدَ الْحَجُونِ، وَهُوَ مُهِلٌّ بِالْحَجِّ، وَلَمْ يَقْرَبِ الْكَعْبَةَ بَعْدَ طَوَافِهِ بِهَا حَتَّى رَجَعَ مِنْ عَرَفَةَ، وَأَمَرَ أَصْحَابَهُ أَنْ يَطَّوَّفُوا بِالْبَيْتِ وَبَيْنَ الصَّفَا وَالْمَرْوَةِ، ثُمَّ يُقَصِّرُوا مِنْ رُءُوسِهِمْ ثُمَّ يَحِلُّوا، وَذَلِكَ لِمَنْ لَمْ يَكُنْ مَعَهُ بَدَنَةٌ قَلَّدَهَا، وَمَنْ كَانَتْ مَعَهُ امْرَأَتُهُ فَهِىَ لَهُ حَلاَلٌ، وَالطِّيبُ وَالثِّيَابُ. [رواه البخاري: ١٥٤٥]

**784.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ (saçlarını) darayıb yağladıqdan, izarını[3] və ridasını[4] geydinkdən sonra əshabələri ilə birlikdə Mədinədən çıxdı. Qoxusu və izi dəridə qalacaq zəfərana boyanmış (geyim) istisna olmaqla, o, (heç kəsə) hər hansı bir izar və ridanı geyinməyi qadağan etmədi. Səhər açıldıqda zül-Hüleyfədə o, öz dəvəsinə minib Beydaya[5] gəldi və

[1] 132-ci hədisin qeydlərinə bax.
[2] Burada şeytana daş atılan sütunlardan ən böyüyü qəsd edilir. Buna da ərəbcə "cəmərətul-əqəbə" deyilir.
[3] 239-cu hədisin qeydlərinə bax.
[4] Bədənin qurşaqdan aşağı hissəsini örtmək üçün istifadə edilən örtük.
[5] Bu, zül-Hüleyfənin bir tərəfidir.

əshabələri ilə birlikdə təlbiyə gətirib ihrama girdi, (sonra da) qurbanlıq heyvanlarının boynuna nişan taxdı. Bütün bunlar Zülqədə ayının bitməsinə beş gün qalana qədər baş verdi. Zülhiccənin dördündə Peyğəmbər ﷺ (əshabələri ilə birlikdə) Məkkəyə gəlib Kəbəni təvaf etdi, (sonra da) Səfa və Mərvə[1] arasında səy etdi. O, qurbanlıq heyvanlarına nişan taxmışdı deyə ihramdan çıxmadı[2]. Daha sonra o (gedib) Məkkənin yuxarı tərəfində yerləşən Həcun dağının yanında dayandı. Bu əsnada o, həcci yerinə yetirmək niyyəti ilə ihramda qalmaqda davam edirdi. İlk təvafdan sonra Ərəfatdan qayıdanadək bir daha Kəbəyə yaxınlaşmadı. Peyğəmbər ﷺ əshabələrinə Kəbəni təvaf etməyi, Səfa və Mərvə arasında səy etməyi, sonra saçlarını qısaltmağı, sonra da ihramdan çıxmağı əmr etdi. Bütün bunlar yanında boynuna nişan taxılmış qurbanlıq heyvanı olmayan ("təməttu" həccini niyyət edən) kimsələrə aid idi. Onlardan zövcəsi ilə gələnlərə onlarla yaxınlıq etmək, habelə ətir vurmaq və libaslarını geyinmək halal edildi." (əl-Buxari, 1545)

## 15-ci fəsil. Təlbiyə gətirmək

## ١٥– باب: التَّلْبِيَةُ

٧٨٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ تَلْبِيَةَ رَسُولِ اللَّهِ ﷺ لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ، لَبَّيْكَ لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ، إِنَّ الْحَمْدَ وَالنِّعْمَةَ لَكَ وَالْمُلْكَ، لاَ شَرِيكَ لَكَ. [رواه البخاري: ١٥٤٩]

**785.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ belə təlbiyə gətirərdi: "Ləbbeykəllahummə ləbbeyk, ləbbeykə lə şərikə ləkə ləbbeyk, innəl-həmdə vən-ni'mətə, ləkə vəl-mulk, lə şərikə lək![3]" (əl-Buxari, 1549)

## 16-cı fəsil. Miniyə minərkən təlbiyədən öncə təhmid, təsbih və təkbir gətirmək[4]

## ١٦– باب: التَّحْمِيدُ وَالتَّسْبِيحُ وَالتَّكْبِيرُ قَبْلَ الإِهْلاَلِ عِنْدَ الرُّكُوبِ عَلَى الدَّابَّةِ

٧٨٦ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ صَلَّى رَسُولُ اللَّهِ ﷺ وَنَحْنُ مَعَهُ بِالْمَدِينَةِ الظُّهْرَ أَرْبَعًا، وَالْعَصْرَ بِذِي الْحُلَيْفَةِ رَكْعَتَيْنِ، ثُمَّ بَاتَ بِهَا حَتَّى أَصْبَحَ، ثُمَّ رَكِبَ حَتَّى اسْتَوَتْ بِهِ عَلَى الْبَيْدَاءِ، حَمِدَ اللَّهَ وَسَبَّحَ وَكَبَّرَ، ثُمَّ أَهَلَّ بِحَجٍّ وَعُمْرَةٍ، وَأَهَلَّ النَّاسُ بِهِمَا، فَلَمَّا قَدِمْنَا أَمَرَ النَّاسَ فَحَلُّوا، حَتَّى كَانَ يَوْمُ التَّرْوِيَةِ أَهَلُّوا بِالْحَجِّ قَالَ وَنَحَرَ النَّبِيُّ ﷺ بَدَنَاتٍ بِيَدِهِ قِيَامًا، وَذَبَحَ رَسُولُ اللَّهِ ﷺ بِالْمَدِينَةِ كَبْشَيْنِ أَمْلَحَيْنِ. [رواه البخاري: ١٥٥١]

**786.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: "Biz Mədinədə Peyğəmbərlə ﷺ birlikdə zöhr namazını dörd rükət, əsr namazını isə zül-Hüleyfədə iki rükət qıldıq. Sonra Peyğəmbər ﷺ orada gecələdi. Səhər açıldıqda dəvəsinə minib Beyda deyilən yerə gəlib "Əlhəmdulilləh", "Subhanəllah" və "Allahu Əkbər"– dedi. Sonra o,

---

[1] 258-ci hədisin qeydlərinə bax.

[2] Peyğəmbər ﷺ ümrə ilə bərabər həcc ziyarətini, başqa sözlə, həccin Qiran növünü yerinə yetirmişdir.

[3] Tərcüməsi: Hüzurundayam, Allahım hüzurundayam! Hüzurundayam, Sənin şərikin yoxdur, hüzurundayam! Həmd Sənədir, nemət və mülk Sənə məxsusdur. Sənin şərikin yoxdur!

[4] Burada, *təhmid* deyildikdə "əlhəmdulilləh", *təsbih* deyildikdə "subhanəllah", *təkbir* deyildikdə isə "Allahu Əkbər" qəsd edilir.

təlbiyə gətirərək həcc və ümrə ziyarəti üçün niyyət etdi, camaat da onunla birlikdə niyyət etdi. Biz Məkkəyə gəlib çatdıqdan (və ümrə ziyarətini yerinə yetirdikdən sonra) o, camaata ihramdan çıxmağı əmr etdi. Nəhayət, Tərviyə günü[1] insanlar həcc üçün niyyət edib ihrama girdilər."

Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ öz əli ilə ayaq üstə durmuş bir neçə dəvəni kəsdi. Peyğəmbər ﷺ Mədinədə də buynuzlu ağlı-qaralı iki qoyun kəsdi. (əl-Buxari, 1551)

## 17-ci fəsil. Qibləyə yönəlib təlbiyə gətirmək

## ١٧– باب: الإِهْلاَلُ مُسْتَقْبِلَ الْقِبْلَةِ

٧٨٧ – عَنْ نَافِعٍ رحمه الله قَالَ: كَانَ ابْنُ عُمَرَ رضي الله عنهما إِذَا صَلَّى بِالْغَدَاةِ بِذِى الْحُلَيْفَةِ أَمَرَ بِرَاحِلَتِهِ فَرُحِلَتْ ثُمَّ رَكِبَ، فَإِذَا اسْتَوَتْ بِهِ اسْتَقْبَلَ الْقِبْلَةَ قَائِمًا، ثُمَّ يُلَبِّى حَتَّى يَبْلُغَ الْمَحْرَمَ، ثُمَّ يُمْسِكُ حَتَّى إِذَا جَاءَ ذَا طُوًى بَاتَ بِهِ حَتَّى يُصْبِحَ، فَإِذَا صَلَّى الْغَدَاةَ اغْتَسَلَ، وَزَعَمَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ فَعَلَ ذَلِكَ. [رواه البخاري: ١٥٥٣]

**787.** Rəvayət edilir ki, Nafi رحمه الله demişdir: "İbn Ömər رضي الله عنهما sübh namazını zül-Hüleyfədə qıldıqdan sonra dəvəsini yəhərləməyi əmr edərdi. Sonra dəvəsinə minər və dəvə ayağa qalxdıqda üzünü qibləyə tərəf tutar və Məscidülhərama gəlib çatanadək təlbiyə gətirər və (oraya gəlib çatdıqdan) sonra təlbiyəni saxlayardı. Daha sonra zu-Tuva vadisinə gəlib səhərə qədər orada qalardı. Sübh namazını qıldıqdan sonra qüsl edərdi. İbn Ömər Peyğəmbərin ﷺ belə etdiyini söyləyərdi." (əl-Buxari, 1553)

## 18-ci fəsil. Vadiyə gəldikdə təlbiyə gətirmək

## ١٨– باب: التَّلْبِيَةُ إِذَا انْحَدَرَ فِى الْوَادِى

٧٨٨ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «أَمَّا مُوسَى كَأَنِّى أَنْظُرُ إِلَيْهِ إِذِ انْحَدَرَ فِى الْوَادِى يُلَبِّى». [رواه البخاري: ١٥٥٥]

**788.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Musa (peyğəmbərə) gəlincə, mən sanki onun bu vadiyə[2] endiyi zaman təlbiyə gətirdiyini görürəm." (əl-Buxari, 1555)

## 19-cu fəsil. Peyğəmbərin ﷺ dövründə onun ihrama girdiyi kimi ihrama girən kimsə haqqında

## ١٩– باب: مَنْ أَهَلَّ فِى زَمَنِ النَّبِىِّ ﷺ كَإِهْلاَلِهِ ﷺ

٧٨٩ – عَنْ أَبِى مُوسَى رضي الله عنه قَالَ بَعَثَنِى النَّبِىُّ ﷺ إِلَى قَوْمٍ بِالْيَمَنِ فَجِئْتُ وَهُوَ بِالْبَطْحَاءِ فَقَالَ: «بِمَا أَهْلَلْتَ». قُلْتُ أَهْلَلْتُ كَإِهْلاَلِ النَّبِىِّ ﷺ قَالَ: «هَلْ مَعَكَ مِنْ هَدْىٍ». قُلْتُ لاَ. فَأَمَرَنِى فَطُفْتُ بِالْبَيْتِ وَبِالصَّفَا وَالْمَرْوَةِ ثُمَّ

---

[1] 132-ci hədisin qeydlərinə bax.

[2] Burada Məkkədən bir mil aralıda yerləşən Əzrəq vadisi nəzərdə tutulur.

أَمَرَنِى فَأَحْلَلْتُ فَأَتَيْتُ امْرَأَةً مِنْ قَوْمِى فَمَشَطَتْنِى، أَوْ غَسَلَتْ رَأْسِى، فَقَدِمَ عُمَرُ ﷺ فَقَالَ: إِنْ نَأْخُذْ بِكِتَابِ اللَّهِ فَإِنَّهُ يَأْمُرُنَا بِالتَّمَامِ قَالَ اللَّهُ: ﴿وَأَتِمُّوا۟ ٱلْحَجَّ وَٱلْعُمْرَةَ لِلَّهِ﴾ وَإِنْ نَأْخُذْ بِسُنَّةِ النَّبِىِّ ﷺ فَإِنَّهُ لَمْ يَحِلَّ حَتَّى نَحَرَ الْهَدْىَ. [رواه البخاري: ١٥٥٩]

**789.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "Peyğəmbər ﷺ məni Yəməndəki bir tayfanın yanına göndərdi. Mən geri qayıtdıqda Bəthada ona rast gəldim. O (məndən): "Hansı niyyətlə ihrama girdin?"– deyə soruşdu. Dedim: "Peyğəmbərin ﷺ ihrama girdiyi kimi ihrama girdim." (Məndən): "Özünlə qurbanlıq heyvanı gətirmisənmi?"– deyə soruşdu. Mən: "Xeyr!"– dedim. Bundan sonra mən onun əmri ilə Kəbəni təvaf etdim, Səfa və Mərvə arasında səy etdim, sonra da ihramdan çıxdım. Bundan sonra qövmümdən olan bir qadının yanına gəldim və o, mənim saçımı daradı (və ya başımı yudu).

Ömər (xəlifə olduqdan sonra) oraya gəlib dedi: "Əgər biz Allahın Kitabını əsas götürürüksə, (bilin ki,) bu Kitab bizə (ziyarəti) tamamlamağı əmr edir. Uca Allah buyurur: "Allah üçün həcc və ümrəni tam yerinə yetirin."[1] Və əgər biz Peyğəmbərin ﷺ Sünnəsini əsas tuturuqsa, (bilin ki,) o, qurbanlıq heyvanını kəsənədək ihramdan çıxmamışdır." (əl-Buxari, 1559)

## 20-ci fəsil. Uca Allahın: «Həcc *ziyarəti* məlum olan aylardadır...»[2] sözü

## ٢٠– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿ٱلْحَجُّ أَشْهُرٌ مَّعْلُومَٰتٌ﴾

٧٩٠ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: خَرَجْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ فِى أَشْهُرِ الْحَجِّ، وَلَيَالِى الْحَجِّ وَحُرُمِ الْحَجِّ، فَنَزَلْنَا بِسَرِفَ قَالَتْ فَخَرَجَ إِلَى أَصْحَابِهِ فَقَالَ: «مَنْ لَمْ يَكُنْ مِنْكُمْ مَعَهُ هَدْىٌ فَأَحَبَّ أَنْ يَجْعَلَهَا عُمْرَةً فَلْيَفْعَلْ، وَمَنْ كَانَ مَعَهُ الْهَدْىُ فَلاَ». قَالَتْ فَالآخِذُ بِهَا وَالتَّارِكُ لَهَا مِنْ أَصْحَابِهِ قَالَتْ فَأَمَّا رَسُولُ اللَّهِ ﷺ وَرِجَالٌ مِنْ أَصْحَابِهِ فَكَانُوا أَهْلَ قُوَّةٍ، وَكَانَ مَعَهُمُ الْهَدْىُ، فَلَمْ يَقْدِرُوا عَلَى الْعُمْرَةِ قَالَتْ فَدَخَلَ عَلَىَّ رَسُولُ اللَّهِ ﷺ وَأَنَا أَبْكِى فَقَالَ: «مَا يُبْكِيكِ يَا هَنْتَاهْ». قُلْتُ سَمِعْتُ قَوْلَكَ لأَصْحَابِكَ فَمُنِعْتُ الْعُمْرَةَ. قَالَ: «وَمَا شَأْنُكِ». قُلْتُ لاَ أُصَلِّى. قَالَ: «فَلاَ يَضِيرُكِ، إِنَّمَا أَنْتِ امْرَأَةٌ مِنْ بَنَاتِ آدَمَ كَتَبَ اللَّهُ عَلَيْكِ مَا كَتَبَ عَلَيْهِنَّ، فَكُونِى فِى حَجَّتِكِ، فَعَسَى اللَّهُ أَنْ يَرْزُقَكِيهَا». قَالَتْ فَخَرَجْنَا فِى حَجَّتِهِ حَتَّى قَدِمْنَا مِنًى فَطَهَرْتُ، ثُمَّ خَرَجْتُ مِنْ مِنًى فَأَفَضْتُ بِالْبَيْتِ قَالَتْ ثُمَّ خَرَجَتْ مَعَهُ فِى النَّفْرِ الآخِرِ حَتَّى نَزَلَ الْمُحَصَّبَ، وَنَزَلْنَا مَعَهُ فَدَعَا عَبْدَ الرَّحْمَنِ بْنَ أَبِى بَكْرٍ ﵄ فَقَالَ: «اخْرُجْ بِأُخْتِكَ مِنَ الْحَرَمِ، فَلْتُهِلَّ بِعُمْرَةٍ ثُمَّ افْرُغَا، ثُمَّ ائْتِيَا هَا هُنَا، فَإِنِّى أَنْظُرُكُمَا حَتَّى تَأْتِيَانِى». قَالَتْ: فَخَرَجْنَا حَتَّى إِذَا فَرَغْتُ، وَفَرَغْتُ مِنَ الطَّوَافِ ثُمَّ جِئْتُهُ بِسَحَرَ فَقَالَ: «هَلْ فَرَغْتُمْ». فَقُلْتُ نَعَمْ. فَآذَنَ بِالرَّحِيلِ فِى أَصْحَابِهِ، فَارْتَحَلَ النَّاسُ فَمَرَّ مُتَوَجِّهًا إِلَى الْمَدِينَةِ. [رواه البخاري: ١٥٦٠]

**790.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Biz həcc aylarında və günlərində, ihramda ikən qadağan olunan əməllərdən çəkinərək Peyğəmbərlə ﷺ birlikdə (Məkkəyə) yola düşdük və (nəhayət,) gəlib Sərif deyilən yerdə dayandıq. (Orada) Peyğəmbər ﷺ əshabələrinin qarşısına çıxıb dedi: "Aranızdan özü ilə qurbanlıq heyvanı

[1] "əl-Bəqərə" surəsi, 196.
[2] "əl-Bəqərə" surəsi, 197.

gətirməyən kimsələr ümrə ziyarətini[1] yerinə yetirmək istəyirlərsə, qoy yerinə yetirsinlər, özü ilə qurbanlıq gətirən kimsələr isə ihramdan çıxmasınlar."

Aişə dedi: "Əshabələrdən kimisi ümrə ziyarətini etdikdən sonra ihramdan çıxdı, kimisi də ihramda qaldı. O ki qaldı Peyğəmbərə ﷺ və onunla olan bir dəstə əshabəyə, onlar qüvvətli idilər, həm də özləri ilə qurbanlıq gətirmişdilər; bu səbəbdən də onlar ümrəni (müstəqil şəkildə) yerinə yetirə bilmədilər. Peyğəmbər ﷺ mənim yanıma gəldi və mənim ağladığımı (görüb) soruşdu: "Səni ağladan nədir, ay (qız)?" Dedim: "Sənin əshabələrinə dediyin sözü eşitdim. Demək, mən ümrə edə bilməyəcəyəm." Peyğəmbər ﷺ: "Sənə nə olub?"– deyə soruşdu. Dedim: "Mən namaz qılmıram.[2]" Peyğəmbər ﷺ buyurdu: "Zərər yoxdur, sən Adəm qızlarından birisən. Allah onlar üçün əzəldən müəyyən etdiyini sənin üçün də müəyyən etmişdir. Ziyarətinə davam et. Ola bilsin ki, Allah sənə ümrə ziyarətini yerinə yetirməyi də müvəffəq etsin."

Aişə dedi: "Biz ziyarətimizə davam etdik. Nəhayət, Minaya gəlib çatdıqda mən (heyzdən) təmizləndim. Bundan sonra mən Minadan çıxdım və (gedib) Kəbəni təvaf etdim. Zülhiccənin 13-ü Peyğəmbərlə ﷺ birlikdə Minadan qayıdarkən Mühəssəbdə dayandıq. Peyğəmbər ﷺ (qardaşım) Abdur-Rəhman ibn Əbu Bəkri çağırıb buyurdu: "Bacını həramın kənarına[3] apar, qoy (orada) ümrə ziyarəti üçün ihrama girsin; işinizi qurtardıqdan[4] sonra bura qayıdın. Siz gəlincəyə qədər mən sizi gözləyəcəyəm."

Aişə dedi: "Mən qardaşımla birlikdə (Tən'imə) yollandım. Nəhayət, ihrama girdikdən sonra (Məscidülhərama) gəlib (Kəbəni) təvaf etdim və bundan sonra səhərə yaxın Peyğəmbərin ﷺ yanına gəldim. O (bizdən): "(Ümrəni) bitirdinizmi?"– deyə soruşdu. Mən: "Bəli!"– dedim. Bundan sonra Peyğəmbər ﷺ əshabələrinə yola düşəcəklərini elan etdi və Peyğəmbər ﷺ camaatla birlikdə Mədinəyə yola düşdü." (əl-Buxari, 1560)

## 21-ci fəsil. Təməttu, qiran və ifrad həcci[5]. Özü ilə qurbanlıq heyvanı gətirməyən kimsənin etmək istədiyi həccin növünün dəyişdirilməsi

## ٢١– باب: التَّمَتُّعُ وَالإِقْرَانُ وَالإِفْرَادُ بِالْحَجِّ، وَفَسْخُ الْحَجِّ لِمَنْ لَمْ يَكُنْ مَعَهُ هَدْىٌ

٧٩١ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: خَرَجْنَا مَعَ النَّبِيِّ ﷺ وَلاَ نُرَى إِلاَّ أَنَّهُ الْحَجُّ، فَلَمَّا قَدِمْنَا تَطَوَّفْنَا بِالْبَيْتِ، فَأَمَرَ النَّبِيُّ ﷺ مَنْ لَمْ يَكُنْ سَاقَ الْهَدْىَ أَنْ يَحِلَّ، فَحَلَّ مَنْ لَمْ يَكُنْ سَاقَ الْهَدْىَ، وَنِسَاؤُهُ لَمْ يَسُقْنَ فَأَحْلَلْنَ، قَالَتْ عَائِشَةُ رضي الله عنها فَحِضْتُ فَلَمْ أَطُفْ بِالْبَيْتِ، فَلَمَّا كَانَتْ لَيْلَةُ الْحَصْبَةِ قَالَتْ يَا رَسُولَ اللَّهِ، يَرْجِعُ النَّاسُ بِعُمْرَةٍ وَحَجَّةٍ وَأَرْجِعُ أَنَا بِحَجَّةٍ قَالَ: «وَمَا طُفْتِ لَيَالِيَ قَدِمْنَا مَكَّةَ». قُلْتُ لاَ. قَالَ: «فَاذْهَبِي مَعَ أَخِيكِ إِلَى التَّنْعِيمِ، فَأَهِلِّي

[1] Burada həccin "təməttu" növü nəzərdə tutulur.

[2] Aişə رضي الله عنها heyz olduğu üçün namaz qılmırdı.

[3] Burada haram deyildikdə, Məkkə şəhərindəki toxunulmaz ərazi nəzərdə tutulur. Aişənin رضي الله عنها ihrama girdiyi yer isə Tən'imdir.

[4] Burada Aişənin رضي الله عنها ümrə ziyarətini yerinə yetirməsi və Abdur-Rəhmanın onu müşayiət etməsi nəzərdə tutulur

[5] Bunlar həccin növləridir.

بِعُمْرَةٍ ثُمَّ مَوْعِدُكِ كَذَا وَكَذَا». قَالَتْ صَفِيَّةُ مَا أُرَانِى إِلاَّ حَابِسَتَهُمْ. قَالَ: «عَقْرَى حَلْقَى، أَوَمَا طُفْتِ يَوْمَ النَّحْرِ». قَالَتْ قُلْتُ بَلَى. قَالَ: «لاَ بَأْسَ، انْفِرِى». [رواه البخاري: ١٥٦١]

**791.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Biz Peyğəmbərlə ﷺ birlikdə həcc ziyarətinə yollandıq. (Məkkəyə) gəlib çatdıqda Kəbəni təvaf etdik. Peyğəmbər ﷺ özü ilə qurbanlıq heyvan gətirməyənlərə ihramdan çıxmağı əmr etdi və onlar da ihramdan çıxdılar. Onun zövcələri özləri ilə heyvan gətirməmişdilər deyə ihramdam çıxdılar. Mən heyzli olduğum üçün Kəbəni təvaf etmədim. (Nəhayət,) Mühəssəbdə olduğumuz gecə mən dedim: “Ya Rəsulullah, camaat ümrə və həcc ziyarətini yerinə yetirib (evlərinə) qayıdır, mən isə ancaq həcci yerinə yetirmişəm.” Peyğəmbər ﷺ: “Biz Məkkəyə gəldiyimiz gecədə sən təvaf etmədinmi?”– deyə soruşdu. Mən: “Xeyr!”– dedim. O buyurdu: “Qardaşınla birlikdə Tən'imə get və ümrə üçün ihrama gir. Sonra filan yerdə görüşərik.”

Səfiyyə dedi: “Mən elə güman edirdim ki, (heyzli olduğum üçün) onları (yoldan) saxlayacağam.” Peyğəmbər ﷺ dedi: “Zavallı qadın! Məgər sən qurban günü təvaf etməmisən?” O: “Etmişəm”– dedi. Peyğəmbər ﷺ buyurdu: “Zərər yoxdur, gedək!” (əl-Buxari, 1561)

٧٩٢ – عَنْ عَائِشَةَ ﵂ أَنَّهَا قَالَتْ خَرَجْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ عَامَ حَجَّةِ الْوَدَاعِ، فَمِنَّا مَنْ أَهَلَّ بِعُمْرَةٍ، وَمِنَّا مَنْ أَهَلَّ بِحَجَّةٍ وَعُمْرَةٍ، وَمِنَّا مَنْ أَهَلَّ بِالْحَجِّ وَأَهَلَّ رَسُولُ اللَّهِ ﷺ بِالْحَجِّ، فَأَمَّا مَنْ أَهَلَّ بِالْحَجِّ أَوْ جَمَعَ الْحَجَّ وَالْعُمْرَةَ لَمْ يَحِلُّوا حَتَّى كَانَ يَوْمُ النَّحْرِ. [رواه البخاري: ١٥٦٢]

**792.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Vida həcci ilində biz Peyğəmbərlə ﷺ birlikdə (Məkkəyə) yola düşdük. Aramızdan kimisi ümrə niyyəti ilə, kimisi həcc və ümrə niyyəti ilə, kimisi də həcc niyyəti ilə ihrama girdi. Peyğəmbər ﷺ həcc niyyəti ilə ihrama girdi. Həcc niyyəti və ya həcc və ümrə niyyəti ilə ihrama girənlərə gəlincə, onlar qurban gününədək ihramdan çıxmadılar.” (əl-Buxari, 1562)

٧٩٣ – عَنْ مَرْوَانَ بْنِ الْحَكَمِ قَالَ: شَهِدْتُ عُثْمَانَ وَعَلِيًّا وَعُثْمَانُ ﵁ يَنْهَى عَنِ الْمُتْعَةِ وَأَنْ يُجْمَعَ بَيْنَهُمَا. فَلَمَّا رَأَى عَلِيٌّ ﵁، أَهَلَّ بِهِمَا لَبَّيْكَ بِعُمْرَةٍ وَحَجَّةٍ قَالَ: مَا كُنْتُ لأَدَعَ سُنَّةَ النَّبِيِّ ﷺ لِقَوْلِ أَحَدٍ. [رواه البخاري: ١٥٦٣]

**793.** Rəvayət edilir ki, Mərvan ibn Həkəm demişdir: “Mən Osmanı və Əlini gördüm, Osmanın “təməttu-həcci”ni və ümrə ilə həcci birləşdirməyi qadağan etdiyinin şahidi oldum. Bunu görən Əli: “Ləbbeykə bi ümrətin və həccətin[1]”– deyib ümrə ilə həcci niyyət edib ihrama girdi və buyurdu: “Mən heç kəsin sözünə görə Peyğəmbərin ﷺ sünnəsini tərk edən deyiləm.” (əl-Buxari, 1563)

٧٩٤ – عَنِ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ: كَانُوا يَرَوْنَ أَنَّ الْعُمْرَةَ فِى أَشْهُرِ الْحَجِّ مِنْ أَفْجَرِ الْفُجُورِ فِى الأَرْضِ، وَيَجْعَلُونَ الْمُحَرَّمَ صَفَرًا وَيَقُولُونَ إِذَا بَرَأَ الدَّبَرْ، وَعَفَا الأَثَرْ، وَانْسَلَخَ صَفَرْ، حَلَّتِ الْعُمْرَةُ لِمَنِ اعْتَمَرْ. قَدِمَ النَّبِيُّ ﷺ وَأَصْحَابُهُ صَبِيحَةَ رَابِعَةٍ مُهِلِّينَ بِالْحَجِّ، فَأَمَرَهُمْ أَنْ يَجْعَلُوهَا عُمْرَةً فَتَعَاظَمَ ذَلِكَ عِنْدَهُمْ فَقَالُوا يَا رَسُولَ اللَّهِ أَىُّ الْحِلِّ قَالَ: «حِلٌّ كُلُّهُ». [رواه البخاري: ١٥٦٤]

**794.** Rəvayət edilir ki, ibn Abbas ﵄ demişdir: “(İslamaqədərki dövrdə) insanlar həcc aylarında ümrə ziyarətinə getməyi yer üzündə olan ən böyük günahlar-

[1] Tərcüməsi: Ümrə və həcc ziyarətlərini yerinə yetirmək üçün hüzurundayam!

dan hesab edirdilər. Habelə Mühərrəm ayının yerinə Səfər ayını haram aylardan sayırdılar və: "Bel yarası sağaldıqda,[1] iz yox olduqda[2] və səfər ayı bitdikdə ümrə ziyarəti etmək istəyənlər üçün ümrə etmək halaldır"– deyirdilər.

Peyğəmbər ﷺ əshabələri ilə birlikdə (zülhiccənin) dördü səhər həcc niyyəti ilə (Məkkəyə) gəldilər. Lakin Peyğəmbər ﷺ onlara ümrəni yerinə yetirməyi əmr etdi. (Həcc aylarında) bunu etmək onlara ağır gəldi və onlar: "Ya Rəsulullah, (ihramdan çıxdıqdan sonra bizə) nələr halal olacaq?"– deyə soruşdular. Peyğəmbər ﷺ: "Hər şey"[3],– deyə buyurdu." (əl-Buxari, 1564)

٧٩٥ – عَنْ حَفْصَةَ رضي الله عنها زَوْجِ النَّبِيِّ ﷺ أَنَّهَا قَالَتْ يَا رَسُولَ اللَّه، مَا شَأْنُ النَّاسِ حَلُّوا بِعُمْرَةٍ وَلَمْ تَحْلِلْ أَنْتَ مِنْ عُمْرَتِكَ قَالَ: «إِنِّى لَبَّدْتُ رَأْسِى، وَقَلَّدْتُ هَدْيِى فَلاَ أَحِلُّ حَتَّى أَنْحَرَ». [رواه البخاري: ١٥٦٦]

**795.** Rəvayət edilir ki, Peyğəmbərin zövcəsi Həfsə رضي الله عنها demişdir: "Ya Rəsulullah, nə üçün camaat ümrəni yerinə yetirdikdən sonra ihramdan çıxmış, sən isə ümrəni yerinə yetirdikdən sonra ihramdan çıxmamısan. Peyğəmbər ﷺ buyurdu: "Mən saçımı yapışdırmışam[4] və qurbanlıq heyvanıma nişan taxmışam, elə buna görə də heyvanı kəsənədək ihramdan çıxmayacağam." (əl-Buxari, 1566)

٧٩٦ – عَنْ أَبِي جَمْرَةَ نَصْرِ بْنِ عِمْرَانَ الضُّبَعِيِّ قَالَ تَمَتَّعْتُ فَنَهَانِى نَاسٌ، فَسَأَلْتُ ابْنَ عَبَّاسٍ رضي الله عنهما فَأَمَرَنِى، فَرَأَيْتُ فِى الْمَنَامِ كَأَنَّ رَجُلاً يَقُولُ لِى حَجٌّ مَبْرُورٌ وَعُمْرَةٌ مُتَقَبَّلَةٌ، فَأَخْبَرْتُ ابْنَ عَبَّاسٍ رضي الله عنهما فَقَالَ سُنَّةَ النَّبِيِّ ﷺ فَقَالَ لِى أَقِمْ عِنْدِى، فَأَجْعَلَ لَكَ سَهْمًا مِنْ مَالِى. قَالَ شُعْبَةُ فَقُلْتُ لِمَ فَقَالَ لِلرُّؤْيَا الَّتِى رَأَيْتُ. [رواه البخاري: ١٥٦٧]

**796.** Rəvayət edilir ki, Əbu Cəmrə Nəsr ibn İmran əd-Dubəi demişdir: "Mən "təməttu" həccini yerinə yetirmək istədim. Lakin bəziləri bunu mənə məsləhət görmədilər. Mən bu haqda ibn Abbasdan رضي الله عنهما soruşduqda o, mənə "təməttu" həccini yerinə yetirməyi əmr etdi. Sonra yuxumda bir nəfərin mənə: "(Təməttu) qəbul olunan həcc və ümrədir"– dediyini gördüm. Mən bu haqda ibn Abbasa رضي الله عنهما xəbər verdikdə o dedi: "(Bu,) Peyğəmbərin ﷺ Sünnəsidir. Sən mənim yanımda qal, malımın bir hissəsini sənə verəcəyəm."

(Hədisi rəvayət edən) Şobə dedi: "Mən (Əbu Cəmrədən) soruşdum: "Nəyə görə (o, malının bir hissəsini sənə vermək istəyirdi)?" Dedi: "Gördüyüm yuxuya görə." (əl-Buxari, 1567)

٧٩٧ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّه رضي الله عنهما أَنَّهُ حَجَّ مَعَ النَّبِيِّ ﷺ يَوْمَ سَاقَ الْبُدْنَ مَعَهُ، وَقَدْ أَهَلُّوا بِالْحَجِّ مُفْرَدًا، فَقَالَ لَهُمْ: «أَحِلُّوا مِنْ إِحْرَامِكُمْ بِطَوَافِ الْبَيْتِ وَبَيْنَ الصَّفَا وَالْمَرْوَةِ، وَقَصِّرُوا ثُمَّ أَقِيمُوا حَلاَلاً، حَتَّى إِذَا كَانَ يَوْمُ التَّرْوِيَةِ فَأَهِلُّوا بِالْحَجِّ، وَاجْعَلُوا الَّتِى قَدِمْتُمْ بِهَا مُتْعَةً». فَقَالُوا كَيْفَ نَجْعَلُهَا مُتْعَةً وَقَدْ سَمَّيْنَا الْحَجَّ فَقَالَ: «افْعَلُوا مَا أَمَرْتُكُمْ، فَلَوْلاَ أَنِّى سُقْتُ الْهَدْىَ لَفَعَلْتُ مِثْلَ الَّذِى أَمَرْتُكُمْ، وَلَكِنْ لاَ يَحِلُّ مِنِّى حَرَامٌ حَتَّى يَبْلُغَ الْهَدْىُ مَحِلَّهُ»، فَفَعَلُوا. [رواه البخاري: ١٥٦٨]

**797.** Rəvayət edilir ki, Cabir ibn Abullah رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ qurbanlıq dəvələri özü ilə apardığı gün mən də onunla birlikdə həcc ziyarətinə getdim. O

[1] Bununla onlar həcc vaxtı insanları Məkkəyə daşıyan dəvələrin bel yarasını qəsd edirdilər.
[2] Burada ya bel yarasının izi, ya da dəvələrin ayaq izləri nəzərdə tutulur.
[3] Peyğəmbər ﷺ demək istəyirdi ki, ümrə ziyarətini tamamlayıb ihramdan çıxdıqdan sonra ihramda ikən qadağan edilmiş hər şey onlara halal olacaq.
[4] 11-ci fəslin qeydlərinə bax.

vaxt insanlar ancaq həcci yerinə yetirməyi niyyət etmişdilər. (Bununla belə) Peyğəmbər ﷺ onlara buyurdu: "Kəbəni təvaf edin, Səfa və Mərvə arasında səy edin və başınızı qırxdırıb ihramdan çıxın. Bundan sonra (ihramda ikən qadağan edilmiş) hər şey sizə halaldır. Tərviyə[1] günü (həcc niyyəti ilə yenidən) ihrama girin və (Məkkəyə) gəlib çatdıqda ümrə üçün niyyət edin." Onlar dedilər: "Biz təkcə həccə niyyət etdiyimiz halda niyyətimizi necə təməttu həccinə çevirə bilərik?" Peyğəmbər ﷺ buyurdu: "Sizə nə əmr edirəmsə, onu yerinə yetirin. Əgər mən qurbanlıq heyvanı özümlə gətirməsəydim, sizə əmr etdiyimi özüm də edərdim. Lakin qurbanlıq öz yerinə çatıncaya qədər (qurbangahda kəsilənə qədər) ihramda qadağan olunmuş şeylər mənə halal olmaz." Onlar da (deyilənlərə) əməl etdilər." (əl-Buxari, 1568)

## 22-ci fəsil. Təməttu həcci

## ٢٢– باب: التَّمَتُّعُ

٧٩٨ – عَنْ عِمْرَانَ ﷺ قَالَ: تَمَتَّعْنَا عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ فَنَزَلَ الْقُرْآنُ قَالَ رَجُلٌ بِرَأْيِهِ مَا شَاءَ. [رواه البخاري: ١٥٧١]

**798.** Rəvayət edilir ki, İmran ﷺ demişdir: "Biz Peyğəmbərin ﷺ dövründə ikən "təməttu" həcci etdik. Sonra (buna dair) ayə[2] nazil oldu. (Sonralar) bəziləri[3] ictihad edib öz rəylərini söylədilər." (əl-Buxari, 1571)

## 23-cü fəsil. Məkkəyə haradan daxil olmalı?

## ٢٣– باب: مِنْ أَيْنَ يَدْخُلُ مَكَّةَ

٧٩٩ – عَنْ ابْنِ عُمَرَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ دَخَلَ مَكَّةَ مِنْ كَدَاءٍ مِنَ الثَّنِيَّةِ الْعُلْيَا الَّتِي بِالبَطْحَاءِ، وَ خَرَجَ مِنَ الثَّنِيَّةِ السُّفْلَى. [رواه البخاري: ١٥٧٥]

**799.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ Məkkəyə Kəda tərəfdən, Bəthadakı[4] yuxarı dağ keçidindən daxil olar, (çıxanda isə) aşağı dağ keçidindən çıxardı." (əl-Buxari, 1575)

## 24-cü fəsil. Məkkənin fəziləti və onun tikilməsi

## ٢٤– باب: فَضْلُ مَكَّةَ وَبُنْيَانِهَا

٨٠٠ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: سَأَلْتُ النَّبِيَّ ﷺ عَنِ الْجَدْرِ أَمِنَ الْبَيْتِ هُوَ قَالَ: «نَعَمْ». قُلْتُ: فَمَا لَهُمْ لَمْ يُدْخِلُوهُ فِي الْبَيْتِ قَالَ: «إِنَّ قَوْمَكِ قَصَّرَتْ بِهِمُ النَّفَقَةُ». قُلْتُ فَمَا شَأْنُ بَابِهِ مُرْتَفِعًا؟ قَالَ: «فَعَلَ ذَلِكِ قَوْمُكِ لِيُدْخِلُوا مَنْ شَاءُوا وَيَمْنَعُوا مَنْ شَاءُوا، وَلَوْلاَ أَنَّ قَوْمَكِ حَدِيثٌ عَهْدُهُمْ بِالْجَاهِلِيَّةِ فَأَخَافُ أَنْ تُنْكِرَ قُلُوبُهُمْ أَنْ أُدْخِلَ الْجَدْرَ فِي الْبَيْتِ وَأَنْ أُلْصِقَ بَابَهُ بِالأَرْضِ». [رواه البخاري: ١٥٨٤]

---

[1] Tərviyə günü zülhiccənin səkkizidir.
[2] "əl-Bəqərə" surəsi, 196.
[3] Hədisin izahında deyilir ki, burada "bəziləri" deyildikdə Ömər ﷺ və Osman ﷺ nəzərdə tutulur. Belə ki, onlar "təməttu" həccini Sünnədən hesab etmirdilər deyə, camaata "qiran" həccini yerinə yetirməyi məsləhət bilirdilər.
[4] Kəda və Bətha Məkkənin yaxınlığındakı yerdir.

**800.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Peyğəmbərdən ﷺ: “Divar[1] Kəbədəndirmi?”– deyə soruşdum. O: “Bəli”– dedi. Mən soruşdum: “Bəs nə üçün onlar bunu Kəbəyə birləşdirməmişlər?” O buyurdu: “Sənin həmtayfalarının buna maddi imkanı çatmamışdır.” Mən soruşdum: “Bəs nə üçün Kəbənin qapısını yuxarı qaldırmışlar?” Dedi: “Onlar bunu ona görə belə etmişlər ki, dilədikləri kimsəni (Kəbənin) içinə buraxsınlar, dilədiklərini də buraxmasınlar. Əgər sənin qövmün cahiliyyət dövrünə yaxın bir zamanda yaşamasaydı və (müqəddəs Evin quruluşunun dəyişilməsinin) onlarda nifrət oyadacağından qorxmasaydım, mən divarı Kəbəyə birləşdirər, qapını da yerdən qoyardım.” (əl-Buxari, 1584)

**٨٠١** – عَنْ عَائِشَةَ ﵂ أَنَّ النَّبِيَّ ﷺ قَالَ لَهَا: «يَا عَائِشَةُ لَوْلاَ أَنَّ قَوْمَكِ حَدِيثُ عَهْدٍ بِجَاهِلِيَّةٍ لأَمَرْتُ بِالْبَيْتِ فَهُدِمَ، فَأَدْخَلْتُ فِيهِ مَا أُخْرِجَ مِنْهُ وَأَلْزَقْتُهُ بِالأَرْضِ، وَجَعَلْتُ لَهُ بَابَيْنِ بَابًا شَرْقِيًّا وَبَابًا غَرْبِيًّا، فَبَلَغْتُ بِهِ أَسَاسَ إِبْرَاهِيمَ». [رواه البخاري: ١٥٨٦]

**801.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ ona demişdir: “Ey Aişə, əgər sənin qövmün cahiliyyət dövrünə yaxın bir zamanda yaşamasaydı, mən (müqəddəs) Evin uçurdulmasını əmr edərdim; sonra da ondan ayrılanı ona birləşdirər, qapını yerdən qoyar və Evə iki qapı – şərq və qərb qapısı qoyardım. Beləliklə də, onu İbrahimin qoyduğu binövrə əsasında tikərdim.” (əl-Buxari, 1586)

## 25-ci fəsil. Məkkədəki evlərin miras qoyulması, habelə onların satılması və alınması. Həm də insanların Məscidülhəramda eyni hüquqa malik olması

## ٢٥– باب: تَوْرِيثُ دُورِ مَكَّةَ وَبَيْعُهَا وَشِرَاؤُهَا وَأَنَّ النَّاسَ فِى مَسْجِدِ الْحَرَامِ سَوَاءٌ

**٨٠٢** – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ﵄ أَنَّهُ قَالَ: يَا رَسُولَ اللَّهِ، أَيْنَ تَنْزِلُ فِى دَارِكَ بِمَكَّةَ. فَقَالَ: «وَهَلْ تَرَكَ عَقِيلٌ مِنْ رِبَاعٍ أَوْ دُورٍ». وَكَانَ عَقِيلٌ وَرِثَ أَبَا طَالِبٍ هُوَ وَطَالِبٌ وَلَمْ يَرِثْهُ جَعْفَرٌ وَلاَ عَلِيٌّ ﵄ شَيْئًا لأَنَّهُمَا كَانَا مُسْلِمَيْنِ، وَكَانَ عَقِيلٌ وَطَالِبٌ كَافِرَيْنِ. [رواه البخاري: ١٥٨٨]

**802.** Rəvayət edilir ki, Üsamə ibn Zeyd ﵄ demişdir: “Ya Rəsulullah, harada qalacaqsan? Məkkədə öz evindəmi (qalacaqsan)?” Peyğəmbər ﷺ buyurdu: “Məgər Əqil bir ev qoyub ki, (orada qalım)?!”

Əqil və (qardaşı) Talib Əbu Talibin mirasını (özlərinə) götürmüşdülər. Cəfər və Əli müsəlman olduqları üçün mirasdan onlara heç bir şey verilməmişdi. Əqil və Talib kafir idilər.[2]” (əl-Buxari, 1588)

---

[1] Divar deyildikdə Kəbənin yanında yerləşən yarımdairəvi şəkilli, hündür olmayan divar nəzərdə tutulur.

[2] Cəfər, Əli, Əqil və Talib Peyğəmbərin ﷺ əmisi Əbu Talibin oğlanlarıdır. Peyğəmbərin ﷺ qəsd etdiyi ev isə bir zamanlar onun babası Abdul-Muttəlibin olmuş və ondan da oğlanlarına miras qalmışdır. Deməli, Peyğəmbərin ﷺ atası Abdullaha qalmış mirasdan Peyğəmbərə ﷺ də pay düşməliydi. Təəssüf ki, müsəlmanlar Mədinəyə hicrət etdikdən sonra qohum-əqrəbaları onların əmlakını satmış və ya özəlləşdirmişdilər.

## 26-cı fəsil. Peyğəmbərin ﷺ Məkkədə qalması

## ٢٦- باب: نُزُولُ النَّبِيِّ ﷺ مَكَّةَ

٨٠٣ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ مِنَ الْغَدِ يَوْمَ النَّحْرِ وَهُوَ بِمِنًى: «نَحْنُ نَازِلُونَ غَدًا بِخَيْفِ بَنِي كِنَانَةَ حَيْثُ تَقَاسَمُوا عَلَى الْكُفْرِ». يَعْنِي ذَلِكَ الْمُحَصَّبَ، وَذَلِكَ أَنَّ قُرَيْشًا وَكِنَانَةَ تَحَالَفَتْ عَلَى بَنِي هَاشِمٍ وَبَنِي عَبْدِ الْمُطَّلِبِ، أَوْ بَنِي الْمُطَّلِبِ أَنْ لاَ يُنَاكِحُوهُمْ، وَلاَ يُبَايِعُوهُمْ حَتَّى يُسْلِمُوا إِلَيْهِمُ النَّبِيَّ ﷺ. [رواه البخاري: ١٥٩٠]

**803.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ Qurban bayramı günü səhər Minada ikən demişdir: “Sabah biz (inşallah) Bəni-Kinanə qəbiləsinin məhəlləsində – kafir qalacaqlarına dair and içdikləri yerdə – olacağıq.” Peyğəmbər ﷺ Mühəssəb (deyilən yeri) qəsd edirdi. (Bir zaman həmin o yerdə) qureyşlilərlə kinanəlilər and içmişdilər ki, Haşim və Abdul-Muttəlib (va ya Muttəlib) oğulları Peyğəmbəri ﷺ onlara təhvil verməyincə onlarla nə nikah bağlasınlar, nə də alver etsinlər.[1]” (əl-Buxari, 1590)

## 27-ci fəsil. Uca Allahın: «Allah Kəbəni – müqəddəs evi, haram ayı, ..... insanların işlərini yoluna qoymaq *üçün bir vasitə kimi müəyyən* etdi...»[2] sözü

## ٢٧- باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿جَعَلَ اللَّهُ الْكَعْبَةَ الْبَيْتَ الْحَرَامَ قِيَامًا لِلنَّاسِ وَالشَّهْرَ الْحَرَامَ . . .﴾

٨٠٤ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ: «يُخَرِّبُ الْكَعْبَةَ ذُو السُّوَيْقَتَيْنِ مِنَ الْحَبَشَةِ». [رواه البخاري: ١٥٩١]

**804.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kəbəni həbəşistanlı, nazik ayaqlı bir nəfər dağıdacaq.[3]” (əl-Buxari, 1591)

٨٠٥ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كَانُوا يَصُومُونَ عَاشُورَاءَ قَبْلَ أَنْ يُفْرَضَ رَمَضَانُ، وَكَانَ يَوْمًا تُسْتَرُ فِيهِ الْكَعْبَةُ، فَلَمَّا فَرَضَ اللَّهُ رَمَضَانَ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ شَاءَ أَنْ يَصُومَهُ فَلْيَصُمْهُ، وَمَنْ شَاءَ أَنْ يَتْرُكَهُ فَلْيَتْرُكْهُ». [رواه البخاري: ١٥٩٢]

**805.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Ramazan orucu vacib buyurulmamışdan əvvəl (müsəlmanlar) Aşura günü oruc tuturdular. (Hər il) o gün Kəbənin üstünə (təzə) örtük çəkirdilər. Allah (müsəlmanlara) Ramazan orucunu vacib buyurduqda Peyğəmbər ﷺ dedi: “Kim Aşura günü oruc tutmaq istəyirsə, tutsun, tutmaq istəmirsə, tutmasın.” (əl-Buxari, 1592)

٨٠٦ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لَيُحَجَّنَّ الْبَيْتُ وَلَيُعْتَمَرَنَّ بَعْدَ خُرُوجِ يَأْجُوجَ وَمَأْجُوجَ». [رواه البخاري: ١٥٩٣]

**806.** Əbu Səid əl-Xudri رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Yəcuc və Məcuc tayfaları[1] çıxdıqdan sonra da insanlar həcc və ümrə niyyəti ilə (müqəddəs) Evi ziyarət edəcəklər.” (əl-Buxari, 1593)

---

[1] Bu mübarizə üç il davam etmişdir.
[2] “əl-Maidə” surəsi, 97.
[3] Bu, Qiyamət gününə yaxın, yer üzündə tövhid əhli qalmayacağı bir zamanda baş verəcək.

## 28-ci fəsil. Kəbənin dağıdılması

## ٢٨ – باب: هَدْمُ الْكَعْبَةِ

٨٠٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما عَنِ النَّبِيِّ ﷺ قَالَ: «كَأَنِّي بِهِ أَسْوَدَ أَفْحَجَ، يَقْلَعُهَا حَجَرًا حَجَرًا». [رواه البخاري: ١٥٩٥]

**807.** İbn Abbas (r.a.) rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən sanki qara dərili (bir adamın), ayaqları aralı vəziyyətdə durub Kəbənin daşlarını bir-bir sökdüyünü görürəm." (əl-Buxari, 1595)

## 29-cu fəsil. Qara daş haqqında deyilənlər

## ٢٩ – باب: مَا ذُكِرَ فِي الْحَجَرِ الأَسْوَدِ

٨٠٨ – عَنْ عُمَرَ رضي الله عنه أَنَّهُ جَاءَ إِلَى الْحَجَرِ الأَسْوَدِ فَقَبَّلَهُ، فَقَالَ إِنِّي أَعْلَمُ أَنَّكَ حَجَرٌ لاَ تَضُرُّ وَلاَ تَنْفَعُ، وَلَوْلاَ أَنِّي رَأَيْتُ النَّبِيَّ ﷺ يُقَبِّلُكَ مَا قَبَّلْتُكَ. [رواه البخاري: ١٥٩٧]

**808.** Rəvayət edilir ki, Ömər (r.a.) qara daşın yanına gəlib onu öpdü və dedi: "Mən bilirəm ki, sən (adi bir) daşsan – nə zərər, nə də xeyir verə bilərsən. Hərgah mən Peyğəmbərin ﷺ səni öpdüyünü görməsəydim, səni öpməzdim." (əl-Buxari, 1597)

## 30-cu fəsil. Kəbəyə girməyən kimsə haqqında

## ٣٠ – باب: مَنْ لَمْ يَدْخُلِ الْكَعْبَةَ

٨٠٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِي أَوْفَى رضي الله عنه قَالَ: اعْتَمَرَ رَسُولُ اللَّهِ ﷺ فَطَافَ بِالْبَيْتِ وَصَلَّى خَلْفَ الْمَقَامِ رَكْعَتَيْنِ، وَمَعَهُ مَنْ يَسْتُرُهُ مِنَ النَّاسِ فَقَالَ لَهُ رَجُلٌ أَدَخَلَ رَسُولُ اللَّهِ ﷺ الْكَعْبَةَ قَالَ لاَ. [رواه البخاري: ١٦٠٠]

**809.** Rəvayət edilir ki, Abdullah ibn Əbu Əufə (r.a.) demişdir: "Peyğəmbər ﷺ ümrə ziyarətini yerinə yetirdi, Kəbəni təvaf etdikdən sonra İbrahim məqamının arxasında iki rükət namaz qıldı. (Bu əsnada) onun yanında insanları (onun qarşısından keçməyə) qoymayan adamlar var idi."

Bir nəfər Abdullahdan: "Peyğəmbər ﷺ Kəbənin içinə daxil oldumu?"– deyə soruşdu. Abdullah: "Xeyr"– deyə cavab verdi. (əl-Buxari, 1600)

## 31-ci fəsil. Kəbənin içində "Allahu Əkbər" deyən kimsə haqqında

## ٣١ – باب: مَنْ كَبَّرَ فِي نَوَاحِي الْكَعْبَةِ

٨١٠ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ إِنَّ رَسُولَ اللَّهِ ﷺ لَمَّا قَدِمَ أَبَى أَنْ يَدْخُلَ الْبَيْتَ وَفِيهِ الآلِهَةُ فَأَمَرَ بِهَا فَأُخْرِجَتْ فَأَخْرَجُوا صُورَةَ إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ فِي أَيْدِيهِمَا الأَزْلاَمُ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «قَاتَلَهُمُ اللَّهُ أَمَا وَاللَّهِ قَدْ عَلِمُوا أَنَّهُمَا لَمْ يَسْتَقْسِمَا بِهَا قَطُّ». فَدَخَلَ الْبَيْتَ، فَكَبَّرَ فِي نَوَاحِيهِ، وَلَمْ يُصَلِّ فِيهِ. [رواه البخاري: ١٦٠١]

**810.** Rəvayət edilir ki, ibn Abbas (r.a.) demişdir: "Peyğəmbər ﷺ (Məkkəyə) gəldikdə[2] Kəbənin içinə daxil olmaqdan imtina etdi. O zaman Kəbənin içində bütlər var

[1] "əl-Kəhf" surəsinin 93-99-cu ayələrə bax.
[2] Bu hadisə hicrətin 8-ci ilində, Məkkənin fəthi günü baş vermişdir.

idi. Sonra Peyğəmbərin ﷺ əmri ilə bütləri (oradan) çıxartdılar. (Onlarla bərabər) əllərində fal oxlar tutmuş İbrahimin və İsmailin şəkillərini də (bayıra) atdılar. Sonra Peyğəmbər ﷺ buyurdu: "Allah bunların (rəsmini çəkənlərin) kökünü kəssin! Vallahi ki, onlar İbrahim və İsmailin heç vaxt bu oxlarla fala baxmadıqlarını yaxşı bilirlər." Bundan sonra Peyğəmbər ﷺ Kəbəyə daxil olub onun hər tərəfində "Allahu Əkbər"– dedi və (orada) namaz qılmadı." (əl-Buxari, 1601)

## ٣٢– باب: كَيْفَ كَانَ بَدْءُ الرَّمَلِ

## 32-ci fəsil. Kəbəni təvaf etdikdə tez-tez yeriyərək dövrə vurmaq nə vaxtdan başlamışdır

٨١١ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ قَدِمَ رَسُولُ اللَّهِ ﷺ وَأَصْحَابُهُ فَقَالَ الْمُشْرِكُونَ إِنَّهُ يَقْدَمُ عَلَيْكُمْ، وَقَدْ وَهَنَهُمْ حُمَّى يَثْرِبَ. فَأَمَرَهُمُ النَّبِيُّ ﷺ أَنْ يَرْمُلُوا الأَشْوَاطَ الثَّلاَثَةَ، وَأَنْ يَمْشُوا مَا بَيْنَ الرُّكْنَيْنِ، وَلَمْ يَمْنَعْهُ أَنْ يَأْمُرَهُمْ أَنْ يَرْمُلُوا الأَشْوَاطَ كُلَّهَا إِلاَّ الإِبْقَاءُ عَلَيْهِمْ. [رواه البخاري: ١٦٠٢]

**811.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ əshabələri ilə birlikdə (Məkkəyə) gəldikdə müşriklər: "Muhəmməd buraya gəlir, Yəsrib[1] qızdırması onları zəiflətmişdir." Onda Peyğəmbər ﷺ əshabələrinə (təvafın) ilk üç dövrəsində tez-tez yeriməyi və iki künc[2] arasında (yavaş) yeriməyi əmr etdi. Peyğəmbərin ﷺ əshabələrə dövrələrin hamısında tez-tez yeriməyi əmr etməsinə mane olan yalnız onlara qarşı şəfqətli olması idi." (əl-Buxari, 1602)

## ٣٣– باب: اسْتِلاَمُ الْحَجَرِ الأَسْوَدِ حِينَ يَقْدَمُ مَكَّةَ أَوَّلَ مَا يَطُوفُ وَيَرْمُلُ ثَلاَثًا

## 33-cü fəsil. Kəbəyə gələn adam təvaf edərkən (hər dövrədə) qara daşa toxunmalı, habelə (ilk) üç dövrədə tez-tez yeriməlidir

٨١٢ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ حِينَ يَقْدَمُ مَكَّةَ، إِذَا اسْتَلَمَ الرُّكْنَ الأَسْوَدَ أَوَّلَ مَا يَطُوفُ يَخُبُّ ثَلاَثَةَ أَطْوَافٍ مِنَ السَّبْعِ. [رواه البخاري: ١٦٠٣]

**812.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Mən Peyğəmbərin ﷺ Məkkəyə gəldiyi zaman (Kəbəni) təvaf etməyə başladıqda qara daşa toxunduğunu və yeddi dövrədən ilk üçünü tez-tez yeriyərək başa vurduğunu gördüm." (əl-Buxari, 1603)

## ٣٤– باب: الرَّمَلُ فِي الْحَجِّ وَالْعُمْرَةِ

## 34-cü fəsil. Həcc və ümrə ziyarətlərində (Kəbəni təvaf etdikdə) tez-tez yerimək

٨١٣ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رضي الله عنه قَالَ لِلرُّكْنِ أَمَا وَاللَّهِ إِنِّي لأَعْلَمُ أَنَّكَ حَجَرٌ لاَ تَضُرُّ وَلاَ تَنْفَعُ، وَلَوْلاَ أَنِّي رَأَيْتُ النَّبِيَّ ﷺ اسْتَلَمَكَ مَا اسْتَلَمْتُكَ. فَاسْتَلَمَهُ، ثُمَّ قَالَ فَمَا لَنَا وَلِلرَّمَلِ إِنَّمَا كُنَّا رَاءَيْنَا بِهِ الْمُشْرِكِينَ، وَقَدْ أَهْلَكَهُمُ اللَّهُ. ثُمَّ قَالَ شَيْءٌ صَنَعَهُ النَّبِيُّ ﷺ فَلاَ نُحِبُّ أَنْ نَتْرُكَهُ. [رواه البخاري: ١٦٠٥]

---

[1] Yəsrib Mədinə şəhərinin qədim adıdır.

[2] Burada yəmən küncü ilə qara daş yerləşən küncün arası nəzərdə tutulur.

**813.** Rəvayət edilir ki, Ömər ibn Xəttab ﷺ (Kəbənin qara daş yerləşən) küncünə baxıb: "Mən bilirəm ki, sən (adi bir) daşsan; nə zərər, nə də xeyir verə bilərsən. Əgər mən Peyğəmbərin ﷺ sənə toxunduğunu görməsəydim, sənə toxunmazdım"– dedi və ona toxundu. Sonra dedi: "Nə üçün biz (təvaf etdikdə) tez-tez yeriməliyik?! Axı biz bunu ancaq özümüzü müşriklərə göstərmək üçün edirdik. Allah artıq onları məhv etmişdir."

Sonra (Ömər ﷺ) demişdir: "Peyğəmbər ﷺ belə etmişdir (deyə), biz bunu tərk etmək istəmirik." (əl-Buxari, 1605)

٨١٤ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: مَا تَرَكْتُ اسْتِلاَمَ هَذَيْنِ الرُّكْنَيْنِ فِى شِدَّةٍ وَلاَ رَخَاءٍ، مُنْذُ رَأَيْتُ النَّبِىَّ ﷺ يَسْتَلِمُهُمَا. [رواه البخاري: ١٦٠٦]

**814.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Mən Peyğəmbərin ﷺ bu iki küncə toxunduğunu gördüyüm gündən bəri istər çətinlikdə, istərsə də rahatlıqda, onlara toxunmağı heç vaxt tərk etmədim." (əl-Buxari, 1606)

## 35-ci fəsil. (Kəbənin qara daş yerləşən) küncünə əsa ilə toxunmaq

## ٣٥– باب: اسْتِلاَمُ الرُّكْنِ بِالْمِحْجَنِ

٨١٥ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: طَافَ النَّبِىُّ ﷺ فِى حَجَّةِ الْوَدَاعِ عَلَى بَعِيرٍ، يَسْتَلِمُ الرُّكْنَ بِمِحْجَنٍ. [رواه البخاري: ١٦٠٧]

**815.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ vida həccində dəvəsinin üstündə təvaf etmiş və (Kəbənin qara daş yerləşən) küncünə əsa ilə toxunmuşdur." (əl-Buxari, 1607)

## 36-cı fəsil. (Qara) daşı öpmək

## ٣٦– باب: تَقْبِيلُ الْحَجَرِ

٨١٦ – عَنْ الزُّبَيْرِ بْنِ عَرَبِىٍّ قَالَ: سَأَلَ رَجُلٌ ابْنَ عُمَرَ رضي الله عنهما عَنِ اسْتِلاَمِ الْحَجَرِ. فَقَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَسْتَلِمُهُ وَيُقَبِّلُهُ. قَالَ: قُلْتُ أَرَأَيْتَ إِنْ زُحِمْتُ أَرَأَيْتَ إِنْ غُلِبْتُ قَالَ اجْعَلْ أَرَأَيْتَ بِالْيَمَنِ، رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَسْتَلِمُهُ وَيُقَبِّلُهُ. [رواه البخاري: ١٦١١]

**816.** Rəvayət edilir ki, Zubeyr ibn Arabi demişdir: "Bir nəfər[1] ibn Ömərdən (qara) daşı öpmək barəsində soruşdu. İbn Ömər dedi: "Mən Peyğəmbərin ﷺ ona toxunduğunu və onu öpdüyünü görmüşəm." (Zubeyr) dedi: Mən soruşdum: "Bəs izdiham olsa, nə edim? Bunu etməyə mənə imkan verməsələr, necə olsun?" İbn Ömər رضي الله عنهما (narazılığını bildirib) dedi: "Necə olsun?" sualını saxla Yəmənə. Mən Peyğəmbərin ﷺ ona toxunduğunu və onu öpdüyünü görmüşəm." (əl-Buxari, 1611)

[1] Burada Zubeyr bir nəfər dedikdə özünü qəsd edir.

## ٣٧– باب: مَنْ طَافَ بِالْبَيْتِ إِذَا قَدِمَ مَكَّةَ قَبْلَ أَنْ يَرْجِعَ إِلَى بَيْتِهِ

## 37-ci fəsil. Məkkəyə gəldikdə evinə getməmişdən öncə Kəbəni təvaf edən adam haqqında

٨١٧ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ أَوَّلَ شَيْءٍ بَدَأَ بِهِ حِينَ قَدِمَ النَّبِيُّ ﷺ أَنَّهُ تَوَضَّأَ، ثُمَّ طَافَ، ثُمَّ لَمْ تَكُنْ عُمْرَةً، ثُمَّ حَجَّ أَبُو بَكْرٍ وَعُمَرُ رضي الله عنهما مِثْلَهُ. [رواه البخاري: ١٦١٤]

**817.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ (Məkkəyə) gələn kimi dəstəmaz alıb (Kəbəni) təvaf etdi. Lakin (bu,) ümrə ziyarətinin təvafı deyildi[1]. Sonralar Əbu Bəkr və Ömər رضي الله عنهما həcci onun kimi yerinə yetirirdilər." (əl-Buxari, 1614)

٨١٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا طَافَ فِي الْحَجِّ أَوِ الْعُمْرَةِ أَوَّلَ مَا يَقْدَمُ سَعَى ثَلاَثَةَ أَطْوَافٍ، وَمَشَى أَرْبَعَةً، ثُمَّ سَجَدَ سَجْدَتَيْنِ، ثُمَّ يَطُوفُ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ. [رواه البخاري: ١٦١٦]

**818.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ həcc və ya ümrə ziyarətlərində (Məkkəyə) gələn kimi (Məscidülhərama gedib Kəbəni) təvaf edər – ilk üç dövrəni tez-tez yeriyərək, qalan dörd dövrəni isə (asta) yerişlə başa çatdırardı; sonra iki rükət namaz qılar; sonra da Səfa və Mərvə arasında səy edərdi." (əl-Buxari, 1616)

## ٣٨– باب: الْكَلاَمُ فِي الطَّوَافِ

## 38-ci fəsil. Təvaf əsnasında danışmaq

٨١٩ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ مَرَّ وَهُوَ يَطُوفُ بِالْكَعْبَةِ بِإِنْسَانٍ رَبَطَ يَدَهُ إِلَى إِنْسَانٍ بِسَيْرٍ، أَوْ بِخَيْطٍ، أَوْ بِشَيْءٍ غَيْرِ ذَلِكَ، فَقَطَعَهُ النَّبِيُّ ﷺ بِيَدِهِ، ثُمَّ قَالَ: «قُدْهُ بِيَدِهِ». [رواه البخاري: ١٦٢٠]

**819.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ təvaf əsnasında bir nəfərin yanından keçərkən onun, əlini kəmərlə, yaxud iplə və ya buna bənzər bir şeylə başqa birisinin əlinə bağladığını görüb onu qırdı və: "Əlindən tut apar!"– dedi. (əl-Buxari, 1620)

## ٣٩– باب: لاَ يَطُوفُ بِالْبَيْتِ عُرْيَانٌ وَلاَ يَحُجُّ مُشْرِكٌ

## 39-cu fəsil. Çılpaq olaraq Kəbəni təvaf etmək qadağandır; Allaha şərik qoşan adamın həcc etməsi də habelə

٨٢٠ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه أَنَّ أَبَا بَكْرٍ الصِّدِّيقَ رضي الله عنه بَعَثَهُ فِي الْحَجَّةِ الَّتِي أَمَّرَهُ عَلَيْهِ رَسُولُ اللَّهِ ﷺ قَبْلَ حَجَّةِ الْوَدَاعِ يَوْمَ النَّحْرِ فِي رَهْطٍ يُؤَذِّنُ فِي النَّاسِ: «أَلاَ لاَ يَحُجُّ بَعْدَ الْعَامِ مُشْرِكٌ، وَلاَ يَطُوفُ بِالْبَيْتِ عُرْيَانٌ». [رواه البخاري: ١٦٢٢]

**820.** Əbu Hureyra رضي الله عنه rəvayət etmişdir ki, vida həccindən öncəki (ildə) Peyğəmbər ﷺ Əbu Bəkri camaata başçı təyin edib həcc ziyarətinə göndərdiyi zaman – Qurban günü Əbu Bəkr onu[2] bir dəstə adamla birlikdə (Mina vadisinə) göndərdi

---

[1] Peyğəmbər ﷺ bu təvafı Məkkəyə gəlib çatması münasibəti ilə yerinə yetirmişdir. Buna da ərəbcə "təvaf əl-qudum" deyilir.

[2] Yəni, Əbu Hureyrəni رضي الله عنه.

ki, gedib (oradakılara) elan edək ki, gələn ildən heç bir müşrik həcc ziyarətinə gəlməyəcək və heç kəs lüt-üryan Kəbəni təvaf etməyəcəkdir." (əl-Buxari, 1622)

## 40-cı fəsil. İlk təvafdan sonra Ərəfatdan qayıdana qədər Kəbəyə yaxınlaşmayan və təvaf etməyən kimsə haqqında

## ٤٠ – باب: مَنْ لَمْ يَقْرَبِ الْكَعْبَةَ، وَلَمْ يَطُفْ حَتَّى يَخْرُجَ إِلَى عَرَفَةَ، وَيَرْجِعَ بَعْدَ الطَّوَافِ الأَوَّلِ

٨٢١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ قَدِمَ النَّبِيُّ ﷺ مَكَّةَ، فَطَافَ وَسَعَى بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ، وَلَمْ يَقْرَبِ الْكَعْبَةَ بَعْدَ طَوَافِهِ بِهَا حَتَّى رَجَعَ مِنْ عَرَفَةَ. [رواه البخاري: ١٦٢٥]

**821.** Rəvayət edilir ki, Abdullah ibn Abbas ﵄ demişdir: "Peyğəmbər ﷺ Məkkəyə gələn kimi (Kəbəni) təvaf etdi, Səfa və Mərvə arasında səy etdi və bu təvafdan sonra Ərəfatdan qayıdanadək Kəbəyə yaxınlaşmadı." (əl-Buxari, 1625)

## 41-ci fəsil. Hacılara su vermək

## ٤١ – باب: سِقَايَةُ الْحَاجِّ

٨٢٢ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: اسْتَأْذَنَ الْعَبَّاسُ بْنُ عَبْدِ الْمُطَّلِبِ رضي الله عنه رَسُولَ اللَّهِ ﷺ أَنْ يَبِيتَ بِمَكَّةَ لَيَالِيَ مِنًى مِنْ أَجْلِ سِقَايَتِهِ، فَأَذِنَ لَهُ. [رواه البخاري: ١٦٣٤]

**822.** Rəvayət edilir ki, ibn Ömər ﵄ demişdir: "Abbas ibn Abdul-Muttəlib Mina gecələrində hacılara su vermək (şərəfinə nail olmaq) məqsədilə Məkkədə gecələmək üçün Peyğəmbərdən ﷺ izn istədi, o da ona izn verdi." (əl-Buxari, 1634)

٨٢٣ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ جَاءَ إِلَى السِّقَايَةِ، فَاسْتَسْقَى، فَقَالَ الْعَبَّاسُ يَا فَضْلُ اذْهَبْ إِلَى أُمِّكَ، فَأْتِ رَسُولَ اللَّهِ ﷺ بِشَرَابٍ مِنْ عِنْدِهَا. فَقَالَ: «اسْقِنِي». قَالَ يَا رَسُولَ اللَّهِ إِنَّهُمْ يَجْعَلُونَ أَيْدِيَهُمْ فِيهِ. قَالَ: «اسْقِنِي». فَشَرِبَ مِنْهُ، ثُمَّ أَتَى زَمْزَمَ، وَهُمْ يَسْقُونَ وَيَعْمَلُونَ فِيهَا، فَقَالَ: «اعْمَلُوا، فَإِنَّكُمْ عَلَى عَمَلٍ صَالِحٍ – ثُمَّ قَالَ – لَوْلاَ أَنْ تُغْلَبُوا لَنَزَلْتُ حَتَّى أَضَعَ الْحَبْلَ عَلَى هَذِهِ». – يَعْنِي عَاتِقَهُ – وَأَشَارَ إِلَى عَاتِقِهِ. [رواه البخاري: ١٦٣٥]

**823.** İbn Abbas ﵄ rəvayət edir ki, (həcc ziyarətində) Peyğəmbər ﷺ su paylanılan yerə gəlib su istədi. Abbas dedi: "Ey Fədl[1], get ananın yanına, ondakı sudan Allahın elçisinə gətir!" Peyğəmbər ﷺ: "Mənə bu sudan ver"– dedi. (Abbas) dedi: "Ey Allahın elçisi, axı onlar bu suya əllərini salırlar." Peyğəmbər ﷺ: "Mənə bu sudan ver"– deyib o sudan içdi. Sonra Zəm-zəm quyusunun yanına gəldi. (Abbas və onun uşaqları) quyudan su çıxardıb (insanlara) su verirdilər. Peyğəmbər ﷺ (onlara) dedi: "Çalışın, həqiqətən də, siz yaxşı iş görürsünüz! Əgər (başqalarının) sizin işinizə yiyələnəcəyindən qorxmasaydım, mən də (quyuya) enər və (çəlləyin) ipini buraya qoyub (su çəkərdim)."

Peyğəmbər ﷺ "buraya qoyub"– deyəndə, çiyninə işarə etdi. (əl-Buxari, 1635)

٨٢٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ سَقَيْتُ رَسُولَ اللَّهِ ﷺ مِنْ زَمْزَمَ فَشَرِبَ وَهُوَ قَائِمٌ. قَالَ عَاصِمٌ فَحَلَفَ عِكْرِمَةُ مَا كَانَ يَوْمَئِذٍ إِلاَّ عَلَى بَعِيرٍ. [رواه البخاري: ١٦٣٧]

---

[1] Fədl ﵄ Abbasın ﵁ oğludur.

**824.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "Mən Peyğəmbərə ﷺ Zəm-zəm suyundan verdim və o, (suyu) ayaq üstə içdi."

(Hədisi rəvayət edən) Asim demişdir: "İkrimə o gün Peyğəmbərin ﷺ dəvənin üstündə olduğuna dair and içmişdir." (əl-Buxari, 1637)

## 42-ci fəsil. Səfa və Mərvə dağları arasında səy etməyin vacib olması və Allahın qoyduğu əlamətlərdən sayılması

## ٤٢ – باب: وُجُوبُ الصَّفَا وَالْمَرْوَةِ وَجُعِلَ مِنْ شَعَائِرِ اللَّه

٨٢٥ – عَنْ عُرْوَةَ قَالَ: سَأَلْتُ عَائِشَةَ رضي الله عنها فَقُلْتُ لَهَا أَرَأَيْت قَوْلَ اللَّه تَعَالَى: ﴿إِنَّ ٱلصَّفَا وَٱلْمَرْوَةَ مِن شَعَآئِرِ ٱللَّهِۖ فَمَنْ حَجَّ ٱلْبَيْتَ أَوِ ٱعْتَمَرَ فَلَا جُنَاحَ عَلَيْهِ أَن يَطَّوَّفَ بِهِمَاۚ﴾ فَوَاللَّه مَا عَلَى أَحَد جُنَاحٌ أَنْ لاَ يَطُوفَ بِالصَّفَا وَالْمَرْوَة. قَالَتْ بئْسَ مَا قُلْتَ يَا ابْنَ أُخْتى، إِنَّ هَذه لَوْ كَانَتْ كَمَا أَوَّلْتَهَا عَلَيْه كَانَتْ لاَ جُنَاحَ عَلَيْه أَنْ لاَ يَتَطَوَّفَ بهمَا، وَلَكنَّهَا أُنْزِلَتْ فى الأَنْصَار، كَانُوا قَبْلَ أَنْ يُسْلمُوا يُهلُّونَ لمَنَاةَ الطَّاغيَة الَّتى كَانُوا يَعْبُدُونَهَا عنْدَ الْمُشَلَّل، فَكَانَ مَنْ أَهَلَّ يَتَحَرَّجُ أَنْ يَطُوفَ بالصَّفَا وَالْمَرْوَة، فَلَمَّا أَسْلَمُوا سَأَلُوا رَسُولَ اللَّه ﷺ عَنْ ذَلكَ قَالُوا يَا رَسُولَ اللَّه، إِنَّا كُنَّا نَتَحَرَّجُ أَنْ نَطُوفَ بَيْنَ الصَّفَا وَالْمَرْوَة، فَأَنْزَلَ اللَّهُ تَعَالَى: ﴿إِنَّ ٱلصَّفَا وَٱلْمَرْوَةَ مِن شَعَآئِرِ ٱللَّهِۖ﴾ الآيَةَ. قَالَتْ عَائشَةُ وَقَدْ سَنَّ رَسُولُ اللَّه ﷺ الطَّوَافَ بَيْنَهُمَا، فَلَيْسَ لأَحَد أَنْ يَتْرُكَ الطَّوَافَ بَيْنَهُمَا. [رواه البخاري: ١٦٤٣]

**825.** Rəvayət edilir ki, Urva demişdir: "Mən Aişədən ﷺ Uca Allahın: **"Həqiqətən, Səfa və Mərvə Allahın qoyduğu nişanələrdəndir. Kim *müqəddəs* Evi həcc və ya ümrə *niyyəti ilə* ziyarət edərsə, bunları təvaf etməsində ona heç bir günah olmaz..."**[1] sözü haqqında soruşdum və "Allaha and olsun ki, Səfa və Mərvəni təvaf etməyən kimsəyə günah yoxdur"– dedim. Aişə dedi: "Sənin dediyin necə də pisdir, ey bacım oğlu! Əgər bu ayə sənin dediyin kimi təfsir olunsaydı, şübhəsiz ki, onları təvaf etməmək günah sayılmazdı. Lakin bu ayə ənsar barəsində nazil olmuşdur. Onlar İslam dinini qəbul etməmişdən əvvəl tapındıqları Mənat adlı bütü ziyarət etmək məqsədilə Müşəlləl deyilən yerdən yola düşərdilər. Hər kim Mənatı ziyarət etmək məqsədilə ora gələrdisə, Səfa və Mərvəni təvaf etməyi özünə günah hesab edərdi. İslam dinini qəbul etdikdən sonra onlar Peyğəmbərdən ﷺ: "Ya Rəsulallah, biz cahiliyyət dövründə Səfa və Mərvəni təvaf etməkdən sıxılardıq"– deyə soruşdular və Uca Allah bu ayəni nazil etdi: "Həqiqətən, Səfa və Mərvə Allahın qoyduğu nişanələrdəndir..."

Aişə ﷺ dedi: "Peyğəmbər ﷺ Səfa və Mərvəni təvaf etməyi vacib buyurmuşdur. Odur ki, heç kəs (ziyarət əsnasında) onu tərk edə bilməz."[2] (əl-Buxari, 1643)

---

[1] "əl-Bəqərə" surəsi, 158.

[2] Hədisin davamında Zuhri demişdir: "Mən bu haqda Əbu Bəkr ibn Abdur-Rəhmana xəbər verdim. O dedi: "Mən bu haqda heç nə eşitməmişəm. Bəzi alimlərdən eşitdiyim yalnız budur ki, onlar deyərdilər: "*Ziyarətə gələn* müsəlmanların hamısı Səfa və Mərvə dağlarını təvaf edərdilər. O vaxt ki, Allah Öz Kitabında Kəbəni təvaf etməyi əmr etdi, lakin Səfa və Mərvə dağları barəsində heç nə buyurmadı, əshabələr dedilər: "Ya Rəsulallah! Biz Səfa və Mərvə dağlarını təvaf edərdik. Allah Kəbəni təvaf etmək barəsində ayə nazil etdi, lakin Səfa və Mərvə haqqında heç bir şey nazil etmədi. Məgər bu dağları təvaf etmək günahdır? Bu vaxt Uca Allah bu ayəni nazil etdi: "Həqiqətən, Səfa və Mərvə Allahın qoyduğu nişanələrdəndir." Əbu Bəkr ibn Abdur-Rəhman dedi: "Mənim bildiyimə görə bu ayə cahiliyyət dövründə Səfa və Mərvə dağlarını təvaf etməyi günah hesab edən və bir də o dövrdə bu dağları təvaf edib, lakin İslam dinini qəbul etdikdən sonra Kəbəni təvaf etmək barəsində nazil olan ayəyə əsaslanaraq, bunu günah hesab edən iki dəstəyə cavab olaraq nazil olmuşdur"

## 43-cü fəsil. Səfa və Mərvə arasında səy etmək barəsində deyilənlər

## ٤٣ – باب: مَا جَاءَ فِي السَّعْيِ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ

٨٢٦ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا طَافَ الطَّوَافَ الأَوَّلَ خَبَّ ثَلاثًا وَمَشَى أَرْبَعًا، وَكَانَ يَسْعَى بَطْنَ الْمَسِيلِ إِذَا طَافَ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ. [رواه البخاري: ١٦٤٤]

**826.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ birinci təvafı[1] edərkən ilk üç dövrəni tez-tez yeriyərək, qalan dörd dövrəni isə (asta) yerişlə başa çatdırardı. Səfa və Mərvəni səy etdikdə isə çay məcrasından[2] qaça-qaça keçərdi." (əl-Buxari, 1644)

## 44-cü fəsil. Heyzli qadın təvafdan başqa həccin bütün ayinlərini yerinə yetirməlidir

## ٤٤ – باب: تَقْضِي الْحَائِضُ الْمَنَاسِكَ كُلَّهَا إِلاَّ الطَّوَافَ بِالْبَيْتِ

٨٢٧ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ أَهَلَّ النَّبِيُّ ﷺ هُوَ وَأَصْحَابُهُ بِالْحَجِّ، وَلَيْسَ مَعَ أَحَدٍ مِنْهُمْ هَدْيٌ، غَيْرَ النَّبِيِّ ﷺ وَطَلْحَةَ رضي الله عنه، وَقَدِمَ عَلِيٌّ مِنَ الْيَمَنِ، وَمَعَهُ هَدْيٌ فَقَالَ أَهْلَلْتُ بِمَا أَهَلَّ بِهِ النَّبِيُّ ﷺ. فَأَمَرَ النَّبِيُّ ﷺ أَصْحَابَهُ أَنْ يَجْعَلُوهَا عُمْرَةً، وَيَطُوفُوا، ثُمَّ يُقَصِّرُوا وَيَحِلُّوا، إِلاَّ مَنْ كَانَ مَعَهُ الْهَدْيُ، فَقَالُوا نَنْطَلِقُ إِلَى مِنًى، وَذَكَرُ أَحَدِنَا يَقْطُرُ، فَبَلَغَ النَّبِيَّ ﷺ فَقَالَ: «لَوِ اسْتَقْبَلْتُ مِنْ أَمْرِي مَا اسْتَدْبَرْتُ مَا أَهْدَيْتُ، وَلَوْلاَ أَنَّ مَعِي الْهَدْيَ لأَحْلَلْتُ». [رواه البخاري: ١٦٥١]

**827.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ əshabələri ilə birlikdə həcc niyyəti ilə ihrama girdi. Onlardan yalnız Peyğəmbər ﷺ və Təlhə qurbanlıq heyvanları özləri ilə gətirmişdilər. (Həmin vaxt) Əli (həcc ziyarətinə) Yəməndən gəlmiş və qurbanlıq heyvanı da özü ilə gətirmişdi. O: "Peyğəmbər ﷺ hansı niyyətlə ihrama girmişsə, mən də o niyyətlə ihrama girmişəm"– dedi. Peyğəmbər ﷺ əshabələrinə həcc niyyətlərini ümrə niyyəti ilə dəyişdirməyi, (Kəbəni) təvaf etməyi, saçlarını qısaltmağı və beləliklə də, ihramdan çıxmağı əmr etdi. Yalnız özləri ilə qurbanlıq heyvanları gətirən kimsələrdən başqa. (Bəziləri) dedilər: "Biz qadınlarımızla yaxınlıq etdiyimiz halda durub Minaya gedəcəyik?!" (Deyilənlər) Peyğəmbərə ﷺ gəlib çatdıqda o dedi: "Əgər indi mənə agah olanları əvvəlcədən bilsəydim, qurbanı özümlə gətirməzdim. Yanımda qurbanlıq heyvan olmasaydı, ihramdan çıxardım." (əl-Buxari, 1651)

## 45-ci fəsil. Tərviyə günü[3] zöhr namazı harada qılınmalıdır?

## ٤٥ – باب: أَيْنَ يُصَلِّي الظُّهْرَ يَوْمَ التَّرْوِيَةِ

٨٢٨ – عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ رُفَيْعٍ قَالَ سَأَلْتُ أَنَسَ بْنَ مَالِكٍ رضي الله عنه قُلْتُ أَخْبِرْنِي بِشَيْءٍ عَقَلْتَهُ عَنِ النَّبِيِّ ﷺ أَيْنَ صَلَّى الظُّهْرَ وَالْعَصْرَ يَوْمَ التَّرْوِيَةِ قَالَ بِمِنًى. قُلْتُ فَأَيْنَ صَلَّى الْعَصْرَ يَوْمَ النَّفْرِ قَالَ بِالأَبْطَحِ. ثُمَّ قَالَ افْعَلْ كَمَا يَفْعَلُ أُمَرَاؤُكَ. [رواه البخاري: ١٦٥٣]

[1] Burada, birinci təvaf deyildikdə "təvaf əl-qudum", yəni Peyğəmbərin ﷺ Məkkəyə çatan kimi Məscidülhərama gedib Kəbəni təvaf etməsi nəzərdə tutulur.

[2] Hazırkı gündə həmin yerə yaşıl işıqlardan nişanlar qoyulmuşdur ki, hacılar Səfa və Mərvəni səy edərkən o yerdən qaça-qaça keçsinlər.

[3] 797-ci hədisin qeydlərinə bax.

**828.** Rəvayət edilir ki, Abdul-Əziz ibn Rufey demişdir: "Mən Ənəs ibn Malikə sual verib dedim: "Peyğəmbərin ﷺ (etdiklərindən) xatırladığın bir şey barəsində mənə xəbər ver. (De görək,) Peyğəmbər ﷺ tərviyə günü zöhr və əsr namazlarını harada qılmışdır?" Ənəs ؓ: "Minada"– deyə cavab verdi. Mən soruşdum: "Bəs (zülhiccənin on üçü Minadan) çıxdığı gün əsr namazını harada qılmışdır?" Ənəs: "Əbtəhdə"– deyə cavab verdi. Sonra da buyurdu: "Sən əmirlərinin etdiyi kimi et." (əl-Buxari, 1653)

## ٤٦– باب: صَوْمُ يَوْمِ عَرَفَةَ

## 46-cı fəsil. Ərəfa günü oruc tutmaq

٨٢٩ – عَنْ أُمِّ الْفَضْلِ ؓ قَالَتْ: شَكَّ النَّاسُ يَوْمَ عَرَفَةَ فِي صَوْمِ النَّبِيِّ ﷺ فَبَعَثْتُ إِلَى النَّبِيِّ ﷺ بِشَرَابٍ فَشَرِبَهُ. [رواه البخاري: ١٦٥٨]

**829.** Rəvayət edilir ki, Ummu Fədl ؓ demişdir: "İnsanlar Ərəfa günü Peyğəmbərin ﷺ oruc tutub-tutmadığı barədə şübhəyə düşdülər. Belə olduqda mən Peyğəmbərə ﷺ su göndərdim və o (bu) sudan içdi." (əl-Buxari, 1658)

## ٤٧– باب: التَّهْجِيرُ بِالرَّوَاحِ يَوْمَ عَرَفَةَ

## 47-ci fəsil. Ərəfa günü (Nəmira məscidinə) yollanmaq

٨٣٠ – عَنْ ابْنِ عُمَرَ ؓ أَنَّهُ جَاءَ يَوْمَ عَرَفَةَ حِينَ زَالَتِ الشَّمْسُ، فَصَاحَ عِنْدَ سُرَادِقِ الْحَجَّاجِ، فَخَرَجَ وَعَلَيْهِ مِلْحَفَةٌ مُعَصْفَرَةٌ فَقَالَ: مَا لَكَ يَا أَبَا عَبْدِ الرَّحْمَنِ فَقَالَ: الرَّوَاحَ إِنْ كُنْتَ تُرِيدُ السُّنَّةَ. قَالَ: هَذِهِ السَّاعَةَ؟ قَالَ: نَعَمْ. قَالَ: فَأَنْظِرْنِي حَتَّى أُفِيضَ عَلَى رَأْسِي ثُمَّ أَخْرُجَ. فَنَزَلَ حَتَّى خَرَجَ الْحَجَّاجُ، فَسَارَ بَيْنِي وَبَيْنَ أَبِي، فَقُلْتُ: إِنْ كُنْتَ تُرِيدُ السُّنَّةَ فَاقْصُرِ الْخُطْبَةَ وَعَجِّلِ الْوُقُوفَ. فَجَعَلَ يَنْظُرُ إِلَى عَبْدِ اللَّهِ، فَلَمَّا رَأَى ذَلِكَ عَبْدُ اللَّهِ قَالَ صَدَقَ.
كَتَبَ عَبْدُ الْمَلِكِ إِلَى الْحَجَّاجِ أَنْ لاَ يُخَالِفَ ابْنَ عُمَرَ فِي الْحَجِّ فَجَاءَ ابْنُ عُمَرَ ؓ. [رواه البخاري: ١٦٦٠]

**830.** Rəvayət edilir ki, ibn Ömər ؓ Ərəfa günü gün batandan sonra Həccacın çadırının yanına gəlib (orada) uca səslə qışqırdı. Həccac (bu səsi eşitdikdə) çiynində zəfərana boyanmış bir bürüncəklə bayıra çıxıb dedi: "Sənə nə olub, ey Əbu Abdur-Rəhman?" İbn Ömər dedi: "Sünnəyə riayət etmək istəyirsənsə, (Ərəfata) yollan." Həccac: "Elə bu saat?"– deyə soruşdu. İbn Ömər: "Bəli!"– deyə cavab verdi. Həccac dedi: "Gözlə, başıma su töküb (qüsl edib) çıxıram." Həccac çıxana qədər ibn Ömər dayanıb (onu gözlədi).

(Salim[1]) deyir ki: "Həccac mənimlə atamın arasından keçdi. Mən (Həccaca) dedim: "Əgər Sünnəyə əməl etmək istəyirsənsə, xütbəni qısa et və (Ərəfata) tələs." Həccac Abdullah (ibn Ömərə) baxmağa başladı. İbn Ömər bunu görəndə dedi: "O doğru söylədi."

Bundan əvvəl Abdul-Malik Həccaca məktubla xəbər göndərmişdi ki, həcc ilə bağlı məsələlərdə ibn Ömərə müxalif olmasın." (əl-Buxari, 1660)

---

[1] Salim Abdullah ibn Ömərin ؓ oğludur.

## 48-ci fəsil. Ərəfatda durmaq

## ٤٨– باب: الْوُقُوفُ بِعَرَفَةَ

٨٣١ – عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ﷺ قَالَ: أَضْلَلْتُ بَعِيرًا لِى، فَذَهَبْتُ أَطْلُبُهُ يَوْمَ عَرَفَةَ، فَرَأَيْتُ النَّبِىَّ ﷺ وَاقِفًا بِعَرَفَةَ، فَقُلْتُ هَذَا وَاللَّهِ مِنَ الْحُمْسِ فَمَا شَأْنُهُ هَا هُنَا. [رواه البخاري: ١٦٦٤]

**831.** Rəvayət edilir ki, Cubeyr ibn Mutim ﷺ demişdir: "Ərəfa günü mənim dəvəm itdi və mən onu axtarmağa getdim. (Bu vaxt) Peyğəmbərin ﷺ Ərəfatda dayandığını görəndə (öz-özümə) dedim: "Vallahi, bu adam əhməsilidir.[1] Elə isə onun burada nə işi var?" (əl-Buxari, 1664)

## 49-cu fəsil. Ərəfatdan çıxıb (Müzdəlifəyə) getmək

## ٤٩– باب: السَّيْرُ إِذَا دَفَعَ مِنْ عَرَفَةَ

٨٣٢ – عَنْ أُسَامَةَ ﷺ أَنَّهُ سُئِلَ: كَيْفَ كَانَ رَسُولُ اللَّهِ ﷺ يَسِيرُ فِى حَجَّةِ الْوَدَاعِ حِينَ دَفَعَ قَالَ كَانَ يَسِيرُ الْعَنَقَ، فَإِذَا وَجَدَ فَجْوَةً نَصَّ. [رواه البخاري: ١٦٦٦]

**832.** Rəvayət edilir ki, Üsamədən ﷺ soruşdular: "Vida həccində Peyğəmbər ﷺ Ərəfatdan (Müzdəlifəyə) gedərkən necə hərəkət edirdi?" O dedi: "(Peyğəmbər ﷺ) aramla hərəkət edərdi; yol açıq olduqda isə dəvəsini tez sürüb gedərdi." (əl-Buxari, 1666)

## 50-ci fəsil. Peyğəmbərin ﷺ Ərəfatdan dönərkən qamçı ilə işarə edib əshabələrinə təmkinli olmalarını əmr etməsi

## ٥٠– باب: أَمْرُ النَّبِىِّ ﷺ بِالسَّكِينَةِ عِنْدَ الإِفَاضَةِ، وَإِشَارَتِهِ إِلَيْهِمْ بِالسَّوْطِ

٨٣٣ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّهُ دَفَعَ مَعَ النَّبِىِّ ﷺ يَوْمَ عَرَفَةَ فَسَمِعَ النَّبِىُّ ﷺ وَرَاءَهُ زَجْرًا شَدِيدًا وَضَرْبًا وَصَوْتًا لِلإِبِلِ فَأَشَارَ بِسَوْطِهِ إِلَيْهِمْ وَقَالَ: «أَيُّهَا النَّاسُ عَلَيْكُمْ بِالسَّكِينَةِ، فَإِنَّ الْبِرَّ لَيْسَ بِالإِيضَاعِ». [رواه البخاري: ١٦٧١]

**833.** Rəvayət edilir ki, Ərəfa günü ibn Abbas ﷺ Peyğəmbərlə ﷺ birlikdə Ərəfatdan (Müzdəlifəyə) gedərkən arxadan uca səslər, zərbə səsi və dəvə nəriltisi eşitdi və qamçı ilə işarə edərək buyurdu: "Ey insanlar, sakitliyə riayət edin! Tələsmək yaxşı iş deyildir." (əl-Buxari, 1671)

---

[1] İslamaqədərki dövrdə bəzi ərəb qəbilələri, o cümlədən də qureyş qəbiləsi "əhməsi" – yəni imanında və əqidəsində səmimi olanlardan sayılırdılar. Onların əqidəsinə görə, Ərəfatda durmaq vacib sayılmırdı.

## ٥١– باب: مَنْ قَدَّمَ ضَعَفَةَ أَهْلِه بلَيْلٍ، فَيَقِفُونَ بالْمُزْدَلفَة وَيَدْعُونَ وَيُقَدِّمُ إِذَا غَابَ الْقَمَر

## 51-ci fəsil. Zəif olanların Müzdəlifəyə erkən göndərilməsi, orada dayanıb dua etməsi və ay batdıqdan sonra (Minaya) erkən göndərilməsi haqqında

٨٣٤ – عَنْ أَسْمَاءَ بِنْت أَبِي بَكْرٍ رضي الله عنها أَنَّهَا نَزَلَتْ لَيْلَةَ جَمْعٍ عِنْدَ الْمُزْدَلفَة، فَقَامَتْ تُصَلِّى، فَصَلَّتْ سَاعَةً، ثُمَّ قَالَتْ يَا بُنَىَّ هَلْ غَابَ الْقَمَرُ قُلْتُ لاَ. فَصَلَّتْ سَاعَةً، ثُمَّ قَالَتْ هَلْ غَابَ الْقَمَرُ قُلْتُ نَعَمْ. قَالَتْ فَارْتَحِلُوا. فَارْتَحَلْنَا، وَمَضَيْنَا حَتَّى رَمَت الْجَمْرَةَ، ثُمَّ رَجَعَتْ فَصَلَّت الصُّبْحَ فِى مَنْزِلهَا. فَقُلْتُ لَهَا يَا هَنْتَاهْ مَا أُرَانَا إِلاَّ قَدْ غَلَّسْنَا. قَالَتْ يَا بُنَىَّ، إِنَّ رَسُولَ اللَّهِ ﷺ أَذنَ للظُّعُنِ. [رواه البخاري: ١٦٧٩]

**834.** Rəvayət edilir ki, camaat Müzdəlifəyə toplandığı gecə Əsma bint Əbu Bəkr رضي الله عنها oraya gəlib namaz qıldı. O, bir qədər namaz qıldıqdan sonra (köləlikdən azad etdiyi Abdullahdan): "Oğlum, ay batdımı?"– deyə soruşdu.

(Abdullah dedi:) "Mən: "Xeyr!"- deyə cavab verdim. Əsma bir qədər də namaz qıldıqdan sonra (yenə): "Ay batdımı?"– deyə soruşdu. Mən: "Bəli!"– deyə cavab verdim. Əsma: "Yola düşün!"– deyə buyurdu. Biz (Minaya) yollandıq. Nəhayət, o, gəlib böyük sütuna[1] daş atdıqdan sonra mənzilinə qayıdıb (orada) sübh namazını qıldı. Mən ona dedim: "Xanım, deyəsən, biz (Minaya) çox tez gəlmişik?" O dedi: "Oğlum, Peyğəmbər ﷺ qadınlara izn vermişdir." (əl-Buxari, 1679)

٨٣٥ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: نَزَلْنَا الْمُزْدَلفَةَ فَاسْتَأْذَنَت النَّبِىَّ ﷺ سَوْدَةُ أَنْ تَدْفَعَ قَبْلَ حَطْمَة النَّاس، وَكَانَت امْرَأَةً بَطِيئَةً، فَأَذنَ لَهَا، فَدَفَعَتْ قَبْلَ حَطْمَة النَّاس، وَأَقَمْنَا حَتَّى أَصْبَحْنَا نَحْنُ، ثُمَّ دَفَعْنَا بدَفْعه، فَلأَنْ أَكُونَ اسْتَأْذَنْتُ رَسُولَ اللَّهِ ﷺ كَمَا اسْتَأْذَنَتْ سَوْدَةُ أَحَبُّ إِلَىَّ منْ مَفْرُوحٍ به. [رواه البخاري: ١٦٨١]

**835.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Biz (Ərəfatdan qayıdarkən) Müzdəlifədə dayandıq. Səudə[2] astagəl qadın olduğundan, basırığa düşməsin deyə (gecə ikən oradan çıxıb getmək üçün) Peyğəmbərdən ﷺ izn istədi, o da ona izn verdi. Səudə basırıq düşməmiş oradan çıxıb getdi. Biz isə səhər açılanadək orada qaldıq. Sonra biz Peyğəmbərlə ﷺ birlikdə (Minaya) getdik. Əgər Səudə kimi mən də Peyğəmbərdən ﷺ izn istəmiş olsaydım, bu məni çox sevindirərdi." (əl-Buxari, 1681)

## ٥٢– باب: مَنْ يُصَلِّى الْفَجْرَ بِجَمْعٍ

## 52-ci fəsil. Müzdəlifədə sübh namazının qılındığı vaxt

٨٣٦ – عَنْ عَبْد الرَّحْمَنِ بْنِ يَزِيدَ قَالَ خَرَجْنَا مَعَ عَبْد اللَّه رضي الله عنه إِلَى مَكَّةَ، ثُمَّ قَدمْنَا جَمْعًا، فَصَلَّى الصَّلاَتَيْنِ، كُلَّ صَلاَة وَحْدَهَا بأَذَانٍ وَإِقَامَة، وَالْعَشَاءُ بَيْنَهُمَا، ثُمَّ صَلَّى الْفَجْرَ حينَ طَلَعَ الْفَجْرُ، قَائلٌ يَقُولُ طَلَعَ الْفَجْرُ. وَقَائلٌ يَقُولُ لَمْ يَطْلُعِ الْفَجْرُ. ثُمَّ قَالَ إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِنَّ هَاتَيْنِ الصَّلاَتَيْنِ حُوِّلَتَا عَنْ وَقْتهمَا فِى هَذَا الْمَكَانِ الْمَغْرِبَ

---

[1] 783-cü hədisin qeydlərinə bax.

[2] Peyğəmbərin ﷺ zövcələrindən biridir.

وَالْعِشَاءَ، فَلاَ يَقْدَمُ النَّاسُ جَمْعًا حَتَّى يُعْتِمُوا، وَصَلاَةَ الْفَجْرِ هَذِهِ السَّاعَةَ». ثُمَّ وَقَفَ حَتَّى أَسْفَرَ، ثُمَّ قَالَ لَوْ أَنَّ أَمِيرَ الْمُؤْمِنِينَ أَفَاضَ الآنَ أَصَابَ السُّنَّةَ. فَمَا أَدْرِى أَقَوْلُهُ كَانَ أَسْرَعَ أَمْ دَفْعُ عُثْمَانَ ﷺ فَلَمْ يَزَلْ يُلَبِّى حَتَّى رَمَى جَمْرَةَ الْعَقَبَةِ يَوْمَ النَّحْرِ. [رواه البخاري: ١٦٨٣]

**836.** Rəvayət edilir ki, Abdur-Rəhman ibn Yezid demişdir: "Biz Abdullah ibn Məsudla birlikdə Məkkəyə yola düşdük. (Nəhayət,) gəlib Müzdəlifəyə çatdıqda Abdullah (məğrib və işa) namazlarını qıldı. O, bu namazlardan hər biri üçün azan və iqamə verdi, həm də onların arasında şam yeməyini yedi. Sonra da dan yeri söküldükdə sübh namazını qıldı. Kimisi: "dan yeri sökülmüşdür"- deyir, kimisi də: "sökülməmişdir"- deyirdi. (Abdullah) dedi: "Peyğəmbər ﷺ demişdir: "Burada, bu iki namazın – məğrib və işa namazlarının vaxtı (öz vaxtından bir qədər) qabağa çəkilmişdir. Qoy insanlar axşam namazının vaxtı girənədək Müzdəlifəyə daxil olmasınlar. Sübh namazı isə bu vaxt qılınır." Bundan sonra (Abdullah) dan yeri ağaranadək Müzdəlifədə qaldı. Sonra dedi: "Əgər möminlərin əmiri indi (Minaya) getsə, Sünnəyə uyğun hərəkət etmiş olar."

Osmanın ﷺ bu sözü deyəndən sonra, yoxsa daha əvvəl Müzdəlifədən çıxıb getdiyi yadımda deyil. Daha sonra (Abdullah) Qurban günü böyük sütuna daş atanadək təlbiyə gətirdi." (əl-Buxari, 1683)

## 53-cü fəsil. Müzdəlifədən (Minaya) nə zaman getmək lazımdır?

## ٥٣– باب: مَتَى يُدْفَعُ مِنْ جَمْعٍ

٨٣٧ – عَنْ عُمَرَ ﷺ أَنَّهُ صَلَّى بِجَمْعٍ الصُّبْحَ، ثُمَّ وَقَفَ فَقَالَ إِنَّ الْمُشْرِكِينَ كَانُوا لاَ يُفِيضُونَ حَتَّى تَطْلُعَ الشَّمْسُ، وَيَقُولُونَ أَشْرِقْ ثَبِيرُ. وَأَنَّ النَّبِىَّ ﷺ خَالَفَهُمْ، ثُمَّ أَفَاضَ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ. [رواه البخاري: ١٦٨٤]

**837.** Rəvayət edilir ki, Ömər ﷺ Müzdəlifədə sübh namazını qıldıqdan sonra ayağa qalxdı və dedi: "Müşriklər gün çıxanadək Müzdəlifədən çıxmazdılar və: "Ey Səbir[1], işıqlan!"– deyərdilər. Peyğəmbər ﷺ isə onlara müxalif olmuş və gün çıxmamışdan əvvəl Müzdəlifəni tərk etmişdir." (əl-Buxari, 1684)

## 54-cü fəsil. Qurbanlıq dəvəyə minmək

## ٥٤– باب: رُكُوبُ الْبُدْنِ

٨٣٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ رَأَى رَجُلاً يَسُوقُ بَدَنَةً فَقَالَ: «ارْكَبْهَا». فَقَالَ إِنَّهَا بَدَنَةٌ. فَقَالَ: «ارْكَبْهَا». قَالَ: إِنَّهَا بَدَنَةٌ، قَالَ: «ارْكَبْهَا، وَيْلَكَ». فِى الثَّالِثَةِ أَوْ فِى الثَّانِيَةِ. [رواه البخاري: ١٦٨٩]

**838.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir nəfərin qurbanlıq heyvanı apardığını görüb: "Dəvəyə min!"– deyə buyurdu. Adam: "Bu, qurbanlıq dəvədir"– dedi. (Peyğəmbər ﷺ yenə): "Dəvəyə min!"– deyə buyurdu. Adam: "Bu, qurbanlıq dəvədir"– dedi. (Peyğəmbər ﷺ) ikinci və ya üçüncü dəfə: "Vay sənin halına, dəvəyə min!"- deyə buyurdu. (əl-Buxari, 1689)

[1] Müzdəlifənin yaxınlığında yerləşən dağ.

## 55-ci fəsil. Qurbanlıq heyvanı özü ilə gətirən kimsə haqqında

## ٥٥– باب: مَنْ سَاقَ الْبُدْنَ مَعَهُ

٨٣٩ – عَنْ عَبْدِ اللَّهِ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ تَمَتَّعَ رَسُولُ اللَّهِ ﷺ فِى حَجَّةِ الْوَدَاعِ بِالْعُمْرَةِ إِلَى الْحَجِّ، وَأَهْدَى فَسَاقَ مَعَهُ الْهَدْىَ مِنْ ذِى الْحُلَيْفَةِ، وَبَدَأَ رَسُولُ اللَّهِ ﷺ فَأَهَلَّ بِالْعُمْرَةِ، ثُمَّ أَهَلَّ بِالْحَجِّ، فَتَمَتَّعَ النَّاسُ مَعَ النَّبِىِّ ﷺ بِالْعُمْرَةِ إِلَى الْحَجِّ، فَكَانَ مِنَ النَّاسِ مَنْ أَهْدَى فَسَاقَ الْهَدْىَ، وَمِنْهُمْ مَنْ لَمْ يُهْدِ، فَلَمَّا قَدِمَ النَّبِىُّ ﷺ مَكَّةَ، قَالَ لِلنَّاسِ: «مَنْ كَانَ مِنْكُمْ أَهْدَى فَإِنَّهُ لاَ يَحِلُّ لِشَىْءٍ حَرُمَ مِنْهُ حَتَّى يَقْضِىَ حَجَّهُ، وَمَنْ لَمْ يَكُنْ مِنْكُمْ أَهْدَى فَلْيَطُفْ بِالْبَيْتِ، وَبِالصَّفَا وَالْمَرْوَةِ، وَلْيُقَصِّرْ، وَلْيَحْلِلْ، ثُمَّ لِيُهِلَّ بِالْحَجِّ، فَمَنْ لَمْ يَجِدْ هَدْيًا فَلْيَصُمْ ثَلاَثَةَ أَيَّامٍ فِى الْحَجِّ وَسَبْعَةً إِذَا رَجَعَ إِلَى أَهْلِهِ». [رواه البخاري: ١٦٩١]

**839.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Vida həccində Peyğəmbər ﷺ həccdən əvvəl ümrə ziyarətini yerinə yetirdi, qurbanlıq heyvanı da özü ilə gətirdi. O, qurbanlıq heyvanı zül-Hüleyfədən gətirmişdi. Peyğəmbər ﷺ öncə ümrə, sonra da həcc niyyəti ilə ihrama girdi. İnsanlar da Peyğəmbər ﷺ ilə birlikdə öncə ümrə, sonra da həcc niyyəti ilə ihrama girdilər. Onlardan kimisi qurbanlıq heyvanı özü ilə gətirmiş, kimisi də gətirməmişdi. Peyğəmbər ﷺ Məkkəyə gəlib çatdıqda insanlara dedi: "Sizlərdən qurbanlıq heyvanları özləri ilə gətirənlər həcc ziyarətini tamamlayanadək ihramdan çıxmasınlar; qurbanlıq heyvanları özləri ilə gətirməyənlər isə (müqəddəs) Evi təvaf etsinlər, Səfa və Mərvə arasında səy etsinlər, saçlarını qısaltsınlar və ihramdan çıxsınlar. Sonra (Tərviyə günü) həcc niyyəti ilə ihrama girsinlər. Qurbanlıq tapmayanlar isə həcc günlərində üç gün və ailəsinin yanına qayıtdıqda yeddi gün oruc tutsunlar." (əl-Buxari, 1691)

## 56-cı fəsil. (Qurbanlıq heyvanlarına) nişan qoyduqdan sonra onları kəndirləyən, sonra da ihrama girən kimsə haqqında

## ٥٦– باب: مَنْ أَشْعَرَ وَقَلَّدَ بِذِى الْحُلَيْفَةِ ثُمَّ أَحْرَمَ

٨٤٠ – عَنِ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ وَمَرْوَانَ رضي الله عنهما قَالاَ خَرَجَ النَّبِىُّ ﷺ مِنَ الْمَدِينَةِ زَمَنَ الْحُدَيْبِيَةِ فِى بِضْعَ عَشْرَةَ مِائَةً مِنْ أَصْحَابِهِ، حَتَّى إِذَا كَانُوا بِذِى الْحُلَيْفَةِ قَلَّدَ النَّبِىُّ ﷺ الْهَدْىَ وَأَشْعَرَ وَأَحْرَمَ بِالْعُمْرَةِ. [رواه البخاري: ١٦٩٤–١٦٩٥]

**840.** Rəvayət edilir ki, Misvər ibn Məxrəmə və Mərvan رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Hudeybiyədə (sülh müqaviləsi bağladığı) il mindən çox əshabənin müşayiəti ilə Mədinədən yola çıxdı. Nəhayət, zül-Hüleyfəyə gəlib çatdıqda Peyğəmbər ﷺ qurbanlıq heyvanı kəndirlə bağlayıb boynuna nişan taxdı və ümrə niyyəti ilə ihrama girdi." (əl-Buxari, 1595)

## 57-ci fəsil. Qurbanlıq heyvanlarını öz əlləri ilə kəndirləyən kimsə haqqında

## ٥٧– باب: مَنْ قَلَّدَ الْقَلاَئِدَ بِيَدِهِ

٨٤١ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهُ بَلَغَهَا: أَنَّ عَبْدَ اللَّهِ بْنَ عَبَّاسٍ قَالَ: مَنْ أَهْدَى هَدْيًا حَرُمَ عَلَيْهِ مَا يَحْرُمُ عَلَى الْحَاجِّ حَتَّى يُنْحَرَ هَدْيُهُ. قَالَتْ عَمْرَةُ فَقَالَتْ عَائِشَةُ لَيْسَ كَمَا قَالَ ابْنُ عَبَّاسٍ، أَنَا فَتَلْتُ قَلاَئِدَ هَدْىِ رَسُولِ اللَّهِ ﷺ بِيَدَىَّ ،

ثُمَّ قَلَّدَهَا رَسُولُ اللَّهِ ﷺ بِيَدَيْهِ، ثُمَّ بَعَثَ بِهَا مَعَ أَبِى فَلَمْ يَحْرُمْ عَلَى رَسُولِ اللَّهِ ﷺ شَىْءٌ أَحَلَّهُ اللَّهُ حَتَّى نُحِرَ الْهَدْىُ. [رواه البخاري: ١٧٠٠]

**841.** Rəvayət edilir ki, Aişəyə ﵂ xəbər verdilər ki, ibn Abbas belə demişdir: "Kim qurbanlıq heyvanlarını (Məkkəyə) göndərərsə, hacılara haram olan şeylər, qurbanlar kəsilənədək ona da haram olur." Aişə dedi: "(Xeyr,) ibn Abbasın dediyi kimi deyil. Mən Peyğəmbərin ﷺ qurbanlıq heyvanlarının iplərini öz əllərimlə hördüm. Sonra Peyğəmbər ﷺ öz əlləri ilə heyvanların boynuna nişan taxdı. Daha sonra onları atamla (Məkkəyə) göndərdi. Buna rəğmən, qurbanlıq heyvanları kəsilənədək Allahın Öz peyğəmbərinə ﷺ halal buyurduğu şeylər ona haram edilmədi." (əl-Buxari, 1700)

## 58-ci fəsil. Qoyunları kəndirlə bağlamaq

## ٥٨ – باب: تَقْلِيدُ الْغَنَمِ

٨٤٢ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: أَهْدَى النَّبِىُّ ﷺ مَرَّةً غَنَمًا.
وَ فِي رِوَايَةٍ عَنْهَا قَالَتْ: كُنْتُ أَفْتِلُ الْقَلاَئِدَ لِلنَّبِىِّ ﷺ فَيُقَلِّدُ الْغَنَمَ، وَيُقِيمُ فِى أَهْلِهِ حَلاَلاً. [رواه البخاري: ١٧٠١-١٧٠٢]

**842.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Bir dəfə Peyğəmbər ﷺ (Məkkəyə) qoç göndərdi."

Digər bir rəvayətdə (Aişə) demişdir: "Peyğəmbərin ﷺ heyvanlarının boynuna taxılacaq ipləri mən hörərdim. O, qoyunların boynuna nişan taxdıqdan sonra (onları Məkkəyə göndərər), özü də ailəsinin yanında sərbəst[1] qalardı." (əl-Buxari, 1701-1702)

## 59-cu fəsil. İplərin rəngli yundan olması

## ٥٩ – باب: الْقَلاَئِدُ مِنَ الْعِهْنِ

٨٤٣ – عَنْ أُمِّ الْمُؤْمِنِينَ ﵂ قَالَتْ فَتَلْتُ قَلاَئِدَهَا مِنْ عِهْنٍ كَانَ عِنْدِى. [رواه البخاري: ١٧٠٥]

**843.** Rəvayət edilir ki, möminlərin anası Aişə ﵂ demişdir: "Mən qurbanlıq heyvanların iplərini özümdə olan rəngli yundan hörərdim." (əl-Buxari, 1705)

## 60-cı fəsil. Qurbanlıq dəvələrin üstünə çul[2] qoymaq, (kəsildikdən sonra da) onu sədəqə vermək

## ٦٠ – باب: الْجِلاَلُ لِلْبُدْنِ و التَّصَدُّقُ بِهَا

٨٤٤ – عَنْ عَلِىٍّ ﵁ قَالَ أَمَرَنِى رَسُولُ اللَّهِ ﷺ أَنْ أَتَصَدَّقَ بِجِلاَلِ الْبُدْنِ الَّتِى نَحَرْتُ وَبِجُلُودِهَا. [رواه البخاري: ١٧٠٧]

---

[1] Yəni, ihrama girən kimsələrə haram edilən şeylər ona haram edilməzdi.

[2] Üstündə oturmaq və ya soyuqdan qorunmaq üçün atın və bəzi başqa heyvanların üstünə salınan qıldan və ya yundan toxunma qalın örtük.

**844.** Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Peyğəmbər ﷺ mənə kəsdiyim qurbanlıq dəvələrinin çulunu və dərisini sədəqə verməyi əmr etdi." (əl-Buxari, 1707)

## ٦١– باب: ذَبْحُ الرَّجُلِ الْبَقَرَ عَنْ نِسَائِهِ مِنْ غَيْرِ أَمْرِهِنَّ

## 61-ci fəsil. Kişi öz qadınlarının buyruğunu gözləmədən onların adından inək kəsə bilər

٨٤٥ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: خَرَجْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ لِخَمْسٍ بَقِينَ مِنْ ذِى الْقَعْدَةِ، لاَ نُرَى إِلاَّ الْحَجَّ، فَلَمَّا دَنَوْنَا مِنْ مَكَّةَ أَمَرَ رَسُولُ اللَّهِ ﷺ مَنْ لَمْ يَكُنْ مَعَهُ هَدْىٌ، إِذَا طَافَ وَسَعَى بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ أَنْ يَحِلَّ، قَالَتْ فَدُخِلَ عَلَيْنَا يَوْمَ النَّحْرِ بِلَحْمِ بَقَرٍ. فَقُلْتُ مَا هَذَا قَالَ نَحَرَ رَسُولُ اللَّهِ ﷺ عَنْ أَزْوَاجِهِ. [رواه البخاري: ١٧٠٩]

**845.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Zülqədə ayının axırına beş gün qalmış biz Peyğəmbərlə ﷺ birlikdə həcc niyyəti ilə (Məkkəyə) yollandıq. Biz Məkkəyə yaxınlaşdıqda Peyğəmbər ﷺ özləri ilə qurbanlıq heyvanı gətirməyənlərə (Kəbəni) təvaf edikdən və Səfa və Mərvə arasında səy etdikdən sonra ihramdan çıxmağı əmr etdi."

Aişə dedi: "Qurban günü bizə inək əti gətirdilər. Mən soruşdum: "Bu nədir?" Dedilər ki: "Peyğəmbər ﷺ zövcələrinin əvəzinə qurban kəsmişdir." (əl-Buxari, 1709)

## ٦٢– باب: النَّحْرُ فِى مَنْحَرِ النَّبِىِّ ﷺ بِمِنًى

## 62-ci fəsil. Minada Peyğəmbərin ﷺ qurban kəsdiyi yerdə qurban kəsmək

٨٤٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ كَانَ يَنْحَرُ فِى الْمَنْحَرِ. يَعْنِي مَنْحَرِ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ١٧١٠]

**846.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ (heyvanı) qurbangahda kəsərdi. Yəni, Peyğəmbərin ﷺ qurban kəsdiyi yerdə." (əl-Buxari, 1710)

## ٦٣– باب: نَحْرُ الإِبِلِ مُقَيَّدَةً

## 63-cü fəsil. Dəvəni ayaqları bağlı ikən kəsmək

٨٤٧ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ رَأَى عَلَى رَجُلٍ، قَدْ أَنَاخَ بَدَنَتَهُ يَنْحَرُهَا، قَالَ: ابْعَثْهَا قِيَامًا مُقَيَّدَةً، سُنَّةَ مُحَمَّدٍ ﷺ. [رواه البخاري: ١٧١٣]

**847.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ dəvəsini yerə çökdürüb kəsmək istəyən bir nəfəri görüb dedi: "Onu ayağa qaldır, Peyğəmbərin ﷺ Sünnəsinə müvafiq qayda üzrə – ayaq üstə, həm də ayaqları bağlı olduğu halda (kəs)." (əl-Buxari, 1713)

## 64-cü fəsil. Qurbanlıq heyvandan qəssaba heç bir şey vermək olmaz

٦٤– باب: لاَ يُعْطَى الْجَزَّارُ مِنَ الْهَدْىِ شَيْئًا

٨٤٨ – عَنْ عَلِيٍّ ﷺ قَالَ: بَعَثَنِي النَّبِيُّ ﷺ فَقُمْتُ عَلَى الْبُدْنِ، فَأَمَرَنِي فَقَسَمْتُ لُحُومَهَا، ثُمَّ أَمَرَنِي فَقَسَمْتُ جِلاَلَهَا وَجُلُودَهَا. [رواه البخاري: ١٧١٦]

**848.** Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Peyğəmbər ﷺ məni (qurbangaha) göndərib kəsilən qurbanlara nəzarət etməyi, onların ətini bölüb paylaşdırmağı, çullarını və dərilərini sədəqə verməyi (və qəssaba heç bir şey saxlamamağı) tapşırdı." (əl-Buxari, 1716)

## 65-ci fəsil. Qurbanlıq heyvanlardan həm yemək, həm də sədəqə vermək (olar)

٦٥– باب: مَا يَأْكُلُ مِنَ الْبُدْنِ وَمَا يُتَصَدَّقُ

٨٤٩ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ: كُنَّا لاَ نَأْكُلُ مِنْ لُحُومِ بُدْنِنَا فَوْقَ ثَلاَثِ مِنًى، فَرَخَّصَ لَنَا النَّبِيُّ ﷺ فَقَالَ: «كُلُوا وَتَزَوَّدُوا». فَأَكَلْنَا وَتَزَوَّدْنَا. [رواه البخاري: ١٧١٩]

**849.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Biz qurban kəsdiyimiz heyvanın ətindən, – Minada qaldığımız üç gün istisna olmaqla (başqa günlərdə) – yeməzdik. Belə olduğu halda Peyğəmbər ﷺ bizə rüsxət verib: "Yeyin və (yolunuza) azuqə götürün!"– deyə buyurdu. Biz də yedik və (yolumuza) azuqə götürdük." (əl-Buxari, 1719)

## 66-cı fəsil. İhramdan çıxarkən saçı qırxmaq və ya qısaltmaq

٦٦– باب: الْحَلْقُ وَالتَّقْصِيرِ عِنْدَ الإِحْلاَلِ

٨٥٠ – عَنِ ابْنِ عُمَرَ ﷺ قَالَ: حَلَقَ رَسُولُ اللَّهِ ﷺ فِي حَجَّتِهِ. [رواه البخاري: ١٧٢٦]

**850.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ həcc ziyarətində başını (ülgüclə) qırxdırdı." (əl-Buxari, 1726)

٨٥١ – عَنْهُ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «اللَّهُمَّ ارْحَمِ الْمُحَلِّقِينَ». قَالُوا وَالْمُقَصِّرِينَ يَا رَسُولَ اللَّهِ قَالَ: «اللَّهُمَّ ارْحَمِ الْمُحَلِّقِينَ». قَالُوا وَالْمُقَصِّرِينَ يَا رَسُولَ اللَّهِ قَالَ: «وَالْمُقَصِّرِينَ». [رواه البخاري: ١٧٢٧]

**851.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (vida həccində) dedi: "Allahım, saçını qırxdıranlara rəhm et!" (Əshabələr): "Qısaldanlara da, ya Rəsulullah?"– deyə soruşdular. Dedi: "Allahım, saçını qırxdıranlara rəhm et!" Onlar: "Qısaldanlara da, ya Rəsulullah?"– deyə soruşdular. Dedi: "Qısaldanlara da (rəhm et)!" (əl-Buxari, 1727)

٨٥٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «اللَّهُمَّ اغْفِرْ لِلْمُحَلِّقِينَ». قَالُوا وَلِلْمُقَصِّرِينَ. قَالَ: «اللَّهُمَّ اغْفِرْ لِلْمُحَلِّقِينَ». قَالُوا وَلِلْمُقَصِّرِينَ. قَالَهَا ثَلاَثًا. قَالَ: «وَلِلْمُقَصِّرِينَ». [رواه البخاري: ١٧٢٨]

**852.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (həcc ziyarətində) dedi: "Allahım, saçını qırxdıranları bağışla!" (Əshablər): "Qısaldanları da, (ya Rəsulullah)?"– deyə soruşdular. Dedi: "Allahım, saçını qırxdıranları bağışla!" Onlar: "Qısaldanları da, (ya Rəsulullah)?"– deyə soruşdular. Peyğəmbər ﷺ bu duanı üç dəfə təkrar etdi. (Bundan sonra) dedi: "Qısaldanları da (bağışla)!" (əl-Buxari, 1728)

**٨٥٣** – عَنْ مُعَاوِيَةَ ﷺ قَالَ: قَصَّرْتُ عَنْ رَسُولِ اللَّهِ ﷺ بِمِشْقَصٍ. [رواه البخاري: ١٧٣٠]

**853.** Rəvayət edilir ki, Müaviyə ﷺ demişdir: "Mən oxun iti ucu ilə Peyğəmbərin ﷺ saçını qısaltmışam." (əl-Buxari, 1730)

## 67-ci fəsil. Sütunlara[1] daş atmaq

## ٦٧– باب: رَمْىُ الْجِمَارِ

**٨٥٤** – عَنْ وَبَرَةَ قَالَ: سَأَلْتُ ابْنَ عُمَرَ ﷺ مَتَى أَرْمِى الْجِمَارَ؟ قَالَ إِذَا رَمَى إِمَامُكَ فَارْمِهْ. فَأَعَدْتُ عَلَيْهِ الْمَسْأَلَةَ، قَالَ: كُنَّا نَتَحَيَّنُ، فَإِذَا زَالَتِ الشَّمْسُ رَمَيْنَا. [رواه البخاري: ١٧٤٦]

**854.** Rəvayət edilir ki, Vəbərə demişdir: "Mən ibn Ömərdən ﷺ: "Nə zaman (şeytana) daş atmalıyam?"– deyə soruşdum. O: "Sənin imamın daş atdığı zaman sən də at!"– deyə cavab verdi. Mən bu məsələni ondan təkrar soruşdum. Dedi: "Biz (günortayadək) gözləyərdik. Günəş batmağa meyl etdikdə isə (gedib şeytanı) daşlayardıq." (əl-Buxari, 1746)

## 68-ci fəsil. Daşları sütunlara vadinin aşağı tərəfindən atmaq

## ٦٨– باب: رَمْىُ الْجِمَارِ مِنْ بَطْنِ الْوَادِى

**٨٥٥** – عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ قَالَ: رَمَى عَبْدُ اللَّهِ بْنِ مَسْعُود ﷺ مِنْ بَطْنِ الْوَادِى، فَقُلْتُ يَا أَبَا عَبْدِ الرَّحْمَنِ، إِنَّ نَاسًا يَرْمُونَهَا مِنْ فَوْقِهَا، فَقَالَ: وَالَّذِى لاَ إِلَهَ غَيْرُهُ هَذَا مَقَامُ الَّذِى أُنْزِلَتْ عَلَيْهِ سُورَةُ الْبَقَرَةِ ﷺ. [رواه البخاري: ١٧٤٧]

**855.** Rəvayət edilir ki, Abdur-Rəhman ibn Yezid ﷺ demişdir: "Abdullah ibn Məsud ﷺ daşları sütunlara vadinin aşağı tərəfindən atdı. Mən dedim: "Ey əbu Abdur-Rəhman, insanlar daşları (sütunlara) vadinin yuxarı tərəfindən atırlar." (Abdullah ibn Məsud) dedi: "Özündən başqa məbud olmayan Allaha and olsun ki, bu, "əl-Bəqərə" surəsinin (Peyğəmbərə ﷺ) nazil olduğu yerdir." (əl-Buxari, 1747)

## 69-cu fəsil. Sütunların (hər birinə) yeddi daş atmaq

## ٦٩– باب: رَمْىُ الْجِمَارِ بِسَبْعِ حَصَيَاتٍ

**٨٥٦** – عَنْ عَبْدِ اللَّهِ ﷺ أَنَّهُ انْتَهَى إِلَى الْجَمْرَةِ الْكُبْرَى جَعَلَ الْبَيْتَ عَنْ يَسَارِهِ، وَمِنًى عَنْ يَمِينِهِ، وَرَمَى بِسَبْعٍ، وَقَالَ: هَكَذَا رَمَى الَّذِى أُنْزِلَتْ عَلَيْهِ سُورَةُ الْبَقَرَةِ ﷺ. [رواه البخاري: ١٧٤٨]

---

[1] Burada söhbət şeytanın rəmzi olaraq tikilmiş üç sütundan – kiçik, orta və böyük sütunlardan gedir. Bu sütunlara ərəbcə "cəmərat" deyilir.

**856.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ böyük sütunun yanına gəldi və elə durdu ki, Kəbə onun sol tərəfində, Mina isə sağ tərəfində qaldı. (Sonra sütuna) yeddi ədəd daş atdı və dedi: "Özünə "əl-Bəqərə" surəsi nazil olan kimsə də (daşları) bu cür atardı." (əl-Buxari, 1747)

## ٧٠- باب: إِذَا رَمَى الْجَمْرَتَيْنِ يَقُومُ وَيُسْهِلُ مُسْتَقْبِلَ الْقِبْلَةِ

## 70-ci fəsil. Kiçik və orta sütuna daş atdıqdan sonra düz yerdə dayanıb qibləyə tərəf üz tutmaq

٨٥٧ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ كَانَ يَرْمِي الْجَمْرَةَ الدُّنْيَا بِسَبْعِ حَصَيَاتٍ، يُكَبِّرُ عَلَى إِثْرِ كُلِّ حَصَاةٍ، ثُمَّ يَتَقَدَّمُ حَتَّى يُسْهِلَ فَيَقُومَ مُسْتَقْبِلَ الْقِبْلَةِ فَيَقُومُ طَوِيلاً، وَيَدْعُو وَيَرْفَعُ يَدَيْهِ، ثُمَّ يَرْمِي الْوُسْطَى، ثُمَّ يَأْخُذُ ذَاتَ الشِّمَالِ فَيَسْتَهِلُ وَيَقُومُ مُسْتَقْبِلَ الْقِبْلَةِ فَيَقُومُ طَوِيلاً وَيَدْعُو وَيَرْفَعُ يَدَيْهِ، وَيَقُومُ طَوِيلاً، ثُمَّ يَرْمِي جَمْرَةَ ذَاتِ الْعَقَبَةِ مِنْ بَطْنِ الْوَادِي، وَلاَ يَقِفُ عِنْدَهَا ثُمَّ يَنْصَرِفُ فَيَقُولُ هَكَذَا رَأَيْتُ النَّبِيَّ ﷺ يَفْعَلُهُ. [رواه البخاري: ١٧٥١]

**857.** Rəvayət edilir ki, ibn Ömər ﷺ yaxın sütuna[1] yeddi daş atar və hər daşı atdıqda "Allahu Əkbər" deyərdi. Sonra irəli keçib vadinin aşağı tərəfində üzü qibləyə uzun müddət dayanar və əllərini göyə qaldırıb dua edərdi. Sonra orta sütuna[2] daş atar və (daşları atıb qurtardıqdan) sonra sol tərəfə keçib vadinin aşağı tərəfində üzü qibləyə uzun müddət dayanar və əllərini göyə qaldırıb dua edərdi. Sonra vadinin aşağı tərəfindəki böyük sütuna[3] daş atar, sonra da orada durmadan çıxıb gedərdi və: "Mən Peyğəmbərin ﷺ belə etdiyini gördüm"– deyərdi. (əl-Buxari, 1751)

## ٧١- باب: طَوَافُ الْوَدَاعِ

## 71-ci fəsil. Vida təvafı

٨٥٨ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: أُمِرَ النَّاسُ أَنْ يَكُونَ آخِرُ عَهْدِهِمْ بِالْبَيْتِ، إِلاَّ أَنَّهُ خُفِّفَ عَنِ الْحَائِضِ. [رواه البخاري: ١٧٥٥]

**858.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "(Həcc ziyarətində olan) insanlara son (ayin) olaraq Kəbəni təvaf etmək əmr edilmişdir. Yalnız heyzli qadınlar üçün bu (hökm) yüngülləşdirilmişdir." (əl-Buxari, 1755)

٨٥٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه، أَنَّ النَّبِيَّ ﷺ صَلَّى الظُّهْرَ وَالْعَصْرَ، وَالْمَغْرِبَ وَالْعِشَاءَ، ثُمَّ رَقَدَ رَقْدَةً بِالْمُحَصَّبِ، ثُمَّ رَكِبَ إِلَى الْبَيْتِ فَطَافَ بِهِ. [رواه البخاري: ١٧٥٦]

---

[1] Bu sütun Xeyf məscidinə o biri sütunlardan daha yaxın olduğu üçün ona "əl-Cəmərat əd-Dunya" (yaxın sütun) deyilir. Ona həmçinin "əl-Cəmərat əs-Suğra" (kiçik sütun) da deyirlər. Hacılar zülhiccənin 11-i, 12-si və (Minada qalanlar üçün) 13-ü məhz bu sütundan başlayıb ardıcıl olaraq sütunların hər birinə yeddi daş atmalıdırlar.

[2] Buna ərəbcə "əl-Cəmərat əl-Vusta" deyilir.

[3] Buna ərəbcə "əl-Cəmərat əl-Əqəbə" deyilir.

**859.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ zöhr, əsr, məğrib və işa namazlarını qıldıqdan sonra Mühəssəbdə[1] bir qədər yatdı, sonra da (dəvəsinə) minib Kəbəyə getdi və (vida) təvafını etdi." (əl-Buxari, 1756)

## 72-ci fəsil. İfada[2] təvafından sonra heyz görən qadın (nə etməlidir?)

## ٧٢- باب: إِذَا حَاضَتِ الْمَرْأَةُ بَعْدَ مَا أَفَاضَتْ

٨٦٠ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: رُخِّصَ لِلْحَائِضِ أَنْ تَنْفِرَ إِذَا أَفَاضَتْ. قَالَ وَسَمِعْتُ ابْنَ عُمَرَ رضي الله عنهما يَقُولُ إِنَّهَا لاَ تَنْفِرُ. ثُمَّ سَمِعْتُهُ يَقُولُ بَعْدُ إِنَّ النَّبِيَّ ﷺ رَخَّصَ لَهُنَّ. [رواه البخاري: ١٧٦٠-١٧٦١]

**860.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "İfada təvafını yerinə yetirdikdən sonra heyz görən qadınlara (vida təvafını etmədən Məkkədən) çıxıb getmələrinə rüsxət verilmişdir."

(Hədisi danışan ravi) demişdir: "Mən ibn Ömərin: "Çıxıb gedə bilməz"– dediyini eşitmişdim. Sonra isə onun belə dediyini eşitdim: "Peyğəmbər ﷺ onlara rüsxət vermişdir." (əl-Buxari, 1760-1761)

## 73-cü fəsil. Mühəssəb

## ٧٣- باب: الْمُحَصَّبُ

٨٦١ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما لَيْسَ التَّحْصِيبُ بِشَيْءٍ، إِنَّمَا هُوَ مَنْزِلٌ نَزَلَهُ رَسُولُ اللَّهِ ﷺ. [رواه البخاري: ١٧٦٦]

**861.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Mühəssəb (həcc ziyarətinə aid) bir ayin deyildir[3]. Sadəcə olaraq Peyğəmbər ﷺ (ziyarət əsnasında) həmin yerdə dayanmışdır." (əl-Buxari, 1766)

## 74-cü fəsil. Məkkəyə daxil olmamışdan əvvəl zu-Tuva vadisində dayanmaq

## ٧٤- باب: النُّزُولُ بِذِي طُوًى قَبْلَ أَنْ يَدْخُلَ مَكَّةَ

٨٦٢ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ كَانَ إِذَا أَقْبَلَ بَاتَ بِذِي طُوًى، حَتَّى إِذَا أَصْبَحَ دَخَلَ، وَإِذَا نَفَرَ مَرَّ بِذِي طُوًى وَبَاتَ بِهَا حَتَّى يُصْبِحَ، وَكَانَ يَذْكُرُ أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَفْعَلُ ذَلِكَ. [رواه البخاري: ١٧٦٩]

**862.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما (Məkkəyə) gedərkən zu-Tuva vadisində gecələyər və nəhayət, səhər açıldıqda isə (şəhərə) daxil olardı. Qayıdanda da həmçinin, səhərədək zu-Tuva vadisində qalardı və deyərdi ki: "Peyğəmbər ﷺ də belə edərdi." (əl-Buxari, 1769)

---

[1] 214-cü hədisin qeydlərinə bax.
[2] İfada – bayram günü yerinə yetirilən, həccin rüknü sayılan təvafdır.
[3] Yəni, Mina, Ərəfat və Müzdəlifə kimi mərasim yerlərindən sayılmır.

# ٢٧ – كِتَابُ الْعُمْرَةِ

# 27 – Ümrə kitabı

## ١– باب: وُجُوبُ الْعُمْرَةِ وَفَضْلِهَا

## 1-ci fəsil. Ümrənin vacib olması və onun fəziləti

٨٦٣ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «الْعُمْرَةُ إِلَى الْعُمْرَةِ كَفَّارَةٌ لِمَا بَيْنَهُمَا، وَالْحَجُّ الْمَبْرُورُ لَيْسَ لَهُ جَزَاءٌ إِلاَّ الْجَنَّةُ». [رواه البخاري: ١٧٧٣]

**863.** Əbu Hureyra rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ümrə ziyarəti, növbəti ümrəyədək arada olan (kiçik günahlar üçün) kəffarədir[1]. Qəbul olunmuş həccin mükafatı isə ancaq Cənnətdir." (əl-Buxari, 1773)

## ٢– باب: مَنِ اعْتَمَرَ قَبْلَ الْحَجِّ

## 2-ci fəsil. Həcdən əvvəl ümrə ziyarətini yerinə yetirən kimsə haqqında

٨٦٤ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ سُئِلَ عَنِ الْعُمْرَةِ قَبْلَ الْحَجِّ، فَقَالَ: لاَ بَأْسَ. وَ قَالَ: اعْتَمَرَ النَّبِىُّ ﷺ قَبْلَ أَنْ يَحُجَّ. [رواه البخاري: ١٧٧٤]

**864.** Rəvayət edilir ki, ibn Ömərdən həcdən əvvəl ümrə ziyarətini yerinə yetirmək barəsində soruşdular. (İbn Ömər) dedi: "Zərər yoxdur. Peyğəmbər ﷺ həcc ziyarətindən əvvəl ümrə ziyarətini yerinə yetirmişdir." (əl-Buxari, 1774)

## ٣– باب: كَمِ اعْتَمَرَ النَّبِىُّ ﷺ

## 3-cü fəsil. Peyğəmbər ﷺ neçə dəfə ümrə ziyarəti etmişdir?

٨٦٥ – عَنْ مُجَاهِد قَالَ: دَخَلْتُ أَنَا وَعُرْوَةُ بْنُ الزُّبَيْرِ الْمَسْجِدَ، فَإِذَا عَبْدُ اللَّهِ بْنُ عُمَرَ رضي الله عنهما جَالِسٌ إِلَى حُجْرَةِ عَائِشَةَ رضي الله عنها، وَإِذَا نَاسٌ يُصَلُّونَ فِى الْمَسْجِدِ صَلاَةَ الضُّحَى. قَالَ فَسَأَلْنَاهُ عَنْ صَلاَتِهِمْ. فَقَالَ بِدْعَةٌ. ثُمَّ قَالَ لَهُ كَمِ اعْتَمَرَ رَسُولُ اللَّهِ ﷺ قَالَ أَرْبَعٌ إِحْدَاهُنَّ فِى رَجَبٍ، فَكَرِهْنَا أَنْ نَرُدَّ عَلَيْهِ. قَالَ وَسَمِعْنَا اسْتِنَانَ عَائِشَةَ أُمِّ الْمُؤْمِنِينَ فِى الْحُجْرَةِ، فَقَالَ عُرْوَةُ يَا أُمَّاهُ، يَا أُمَّ الْمُؤْمِنِينَ. أَلاَ تَسْمَعِينَ مَا يَقُولُ أَبُو عَبْدِ الرَّحْمَنِ؟ قَالَتْ مَا يَقُولُ؟ قَالَ يَقُولُ إِنَّ رَسُولَ اللَّهِ ﷺ اعْتَمَرَ أَرْبَعَ عُمَرَاتٍ إِحْدَاهُنَّ فِى رَجَبٍ. قَالَتْ يَرْحَمُ اللَّهُ أَبَا عَبْدِ الرَّحْمَنِ، مَا اعْتَمَرَ عُمْرَةً إِلاَّ وَهُوَ شَاهِدُهُ، وَمَا اعْتَمَرَ فِى رَجَبٍ قَطُّ. [رواه البخاري: ١٧٧٥-١٧٧٦]

**865.** Rəvayət edilir ki, Mücahid demişdir: "Mən Urva ibn Zubeyrlə məscidə daxil olduqda ibn Ömərin Aişənin hücrəsinə söykənib oturduğunu və bəzi adamların məsciddə duha namazını qıldıqlarını gördüm. Biz ibn Ömərdən onların qıldıqları namaz barəsində soruşduq. O: "Bidətdir"- dedi. Biz: "Peyğəmbər ﷺ ne-

[1] 18-ci hədisin qeydlərinə bax.

çə dəfə ümrə ziyarəti etmişdir?"– deyə soruşduq. Dedi: "Dörd dəfə (ümrəyə getmişdir). Bunlardan biri rəcəb ayında idi". Biz ona cavab qaytarmaq istəmədik.

Biz möminlərin anası Aişənin misvakla dişlərini təmizlədiyini eşitdik. Urva dedi: "Ana, ey möminlərin anası, Əbu Abdur-Rəhmanın nə dediyini eşitmirsənmi?" Aişə soruşdu: "O nə deyir ki?" Urva dedi: "O deyir ki, Peyğəmbər ﷺ dörd dəfə ümrə ziyarətini yerinə yetirmiş, bunlardan birini rəcəb ayında etmişdir." Aişə dedi: "Allah Əbu Abdur-Rəhmana mərhəmət etsin! O ki Peyğəmbərin ﷺ ümrə ziyarətlərinin hamısında onun yanında olmuşdur. Peyğəmbər ﷺ heç vaxt rəcəb ayında ümrə etməmişdir." (əl-Buxari, 1775-1776)

٨٦٦ – عَنْ أَنَسٍ ﷺ أَنَّهُ سُئِلَ كَمِ اعْتَمَرَ النَّبِيُّ ﷺ؟ قَالَ: أَرْبَعاً عُمْرَةُ الْحُدَيْبِيَةِ فِى ذِى الْقَعْدَةِ، حَيْثُ صَدَّهُ الْمُشْرِكُونَ، وَعُمْرَةٌ مِنَ الْعَامِ الْمُقْبِلِ فِى ذِى الْقَعْدَةِ، حَيْثُ صَالَحَهُمْ، وَعُمْرَةُ الْجِعْرَانَةِ إِذْ قَسَمَ غَنِيمَةَ أُرَاهُ حُنَيْنٍ. قُلْتُ كَمْ حَجَّ قَالَ وَاحِدَةً. [رواه البخاري: ١٧٧٨]

**866.** Rəvayət edilir ki, Ənəsdən ﷺ: "Peyğəmbər ﷺ neçə dəfə ümrə ziyarəti etmişdir?"– deyə soruşdular. O dedi: "Dörd dəfə: zülqədə ayında müşriklər onun yolunu kəsdikləri vaxt yerinə yetirdiyi Hudeybiyə ümrəsi; müşriklərlə sülh bağladıqdan sonra növbəti il zülqədə ayında yerinə yetirdiyi ümrə; qənimətləri bölüşdürdüyü vaxt yerinə yetirdiyi Ciranə[1] ümrəsi." (Qətadə) dedi: "Deyəsən o, Hüneyn (döyüşündən əldə edilmiş qənimətləri) qəsd edirdi." Mən soruşdum: "Bəs neçə dəfə həcc ziyarətini yerinə yetirmişdir?" O: "Bir dəfə"– deyə cavab verdi." (əl-Buxari, 1778)

٨٦٧ – وَ فِي رِوَايَةٍ أَنَّهُ ﷺ قَالَ: اعْتَمَرَ النَّبِيُّ ﷺ حَيْثُ رَدُّوهُ، وَمِنَ الْقَابِلِ عُمْرَةَ الْحُدَيْبِيَةِ، وَعُمْرَةً فِى ذِى الْقَعْدَةِ وَعُمْرَةً مَعَ حَجَّتِهِ. [رواه البخاري: ١٧٧٩]

**867.** Başqa bir rəvayətdə Ənəs ﷺ demişdir: "Peyğəmbər ﷺ ümrə ziyarətini (müşriklər) onu (Məkkəyə) buraxmadıqları il (olduğu yerdə) yerinə yetirmişdir; habelə növbəti ildə Hudeybiyə ümrəsini yerinə yetirmişdir; (bundan əlavə) o, ümrə ziyarətini bir dəfə zülqədə ayında, bir dəfə də həcc ziyarətində yerinə yetirmişdir." (əl-Buxari, 1779)

٨٦٨ – عَنْ الْبَرَاءِ بْنِ عَازِبٍ ﷺ قَالَ: اعْتَمَرَ رَسُولُ اللَّهِ ﷺ فِى ذِى الْقَعْدَةِ، قَبْلَ أَنْ يَحُجَّ مَرَّتَيْنِ. [رواه البخاري: ١٧٨١]

**868.** Rəvayət edilir ki, Bəra ibn Azib ﷺ demişdir: "Peyğəmbər ﷺ həcc ziyarətindən əvvəl iki dəfə – zülqədə aylarında ümrə ziyarətini yerinə yetirmişdir." (əl-Buxari, 1781)

## 4-cü fəsil. Tənimdən ümrə (niyyəti ilə ihrama girmək)

## ٤ – باب: عُمْرَةُ التَّنْعِيمِ

٨٦٩ – (أ) – عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِى بَكْرٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ أَمَرَهُ أَنْ يُرْدِفَ عَائِشَةَ، وَيُعْمِرَهَا مِنَ التَّنْعِيمِ. [رواه البخاري: ١٧٨٤]

[1] Məkkə yaxınlığında vadi.

**869.** (a) – Abdur-Rəhman ibn Əbu Bəkr ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ ona Aişəni tərkinə alıb (Tənimə) aparmağı, (Aişə niyyət edib ihrama girdikdən sonra) ziyarət boyu onu müşayiət etməyi əmr etmişdir. (əl-Buxari, 1784)

٨٦٩ – (ب) – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵄ أَنَّ سُرَاقَةَ بْنَ مَالِكِ بْنِ جُعْشُمٍ لَقِيَ النَّبِيَّ ﷺ وَهُوَ بِالْعَقَبَةِ، وَهُوَ يَرْمِيهَا، فَقَالَ أَلَكُمْ هَذِهِ خَاصَّةً، يَا رَسُولَ اللَّهِ قَالَ: «لاَ، بَلْ لِلأَبَدِ». [رواه البخاري: ١٧٨٥]

**869.** (b) – Cabir ibn Abdullah ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ böyük sütuna daş atarkən Suraqa ibn Malik ibn Cuşum onunla qarşılaşdı və (ondan): "Bu yalnız sizəmi məxsusdur, ya Rəsulullah?"- deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Xeyr, əbədi olaraq (bütün hacılara vacibdir)." (əl-Buxari, 1785)

## 5-ci fəsil. Həccdən sonra, qurbanlıq götürmədən ümrə ziyarətini yerinə yetirmək

## ٥ – باب: الاِعْتِمَارُ بَعْدَ الْحَجِّ بِغَيْرِ هَدْيٍ

٨٧٠ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ خَرَجْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ مُوَافِينَ لِهِلاَلِ ذِي الْحَجَّةِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ أَحَبَّ أَنْ يُهِلَّ بِعُمْرَةٍ فَلْيُهِلَّ، وَمَنْ أَحَبَّ أَنْ يُهِلَّ بِحَجَّةٍ فَلْيُهِلَّ، وَلَوْلاَ أَنِّي أَهْدَيْتُ لأَهْلَلْتُ بِعُمْرَةٍ». فَمِنْهُمْ مَنْ أَهَلَّ بِعُمْرَةٍ، وَمِنْهُمْ مَنْ أَهَلَّ بِحَجَّةٍ، وَكُنْتُ مِمَّنْ أَهَلَّ بِعُمْرَةٍ، فَحِضْتُ قَبْلَ أَنْ أَدْخُلَ مَكَّةَ، فَأَدْرَكَنِي يَوْمُ عَرَفَةَ، وَأَنَا حَائِضٌ، فَشَكَوْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: دَعِي عُمْرَتَكِ، وَانْقُضِي رَأْسَكِ وَامْتَشِطِي، وَأَهِلِّي بِالْحَجِّ. فَفَعَلْتُ، فَلَمَّا كَانَتْ لَيْلَةُ الْحَصْبَةِ أَرْسَلَ مَعِي عَبْدَ الرَّحْمَنِ إِلَى التَّنْعِيمِ، فَأَرْدَفَهَا، فَأَهَلَّتْ بِعُمْرَةٍ مَكَانَ عُمْرَتِهَا، فَقَضَى اللَّهُ حَجَّهَا وَعُمْرَتَهَا، وَلَمْ يَكُنْ فِي شَيْءٍ مِنْ ذَلِكَ هَدْيٌ، وَلاَ صَدَقَةٌ، وَلاَ صَوْمٌ. [رواه البخاري: ١٧٨٦]

**870.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə zülhiccə ayı girər-girməz (Məkkəyə) yola düşdük." Peyğəmbər ﷺ dedi: "Kim ümrə niyyəti ilə ihrama girmək istəyirsə, qoy (istədiyi kimi) ihrama girsin. Kim də həcc niyyəti ilə ihrama girmək istəyirsə, qoy (istədiyi kimi) ihrama girsin. Əgər qurbanlıq heyvanı özümlə gətirməsəydim, mən də (ayrıca) ümrə niyyəti ilə ihrama girərdim." (Beləliklə,) onlardan kimisi ümrə niyyəti ilə, kimisi də həcc niyyəti ilə ihrama girdi. Mən ümrə niyyəti ilə ihrama girən kimsələrdən idim. Mən Məkkəyə daxil olmazdan əvvəl heyz gördüm. Ərəfa günü gəlib yetişdikdə mən heyzli idim. Odur ki, Peyğəmbərə ﷺ şikayət etdim. O dedi: "Ümrəni sonraya saxla, saçlarını aç, daran və həcc niyyəti ilə ihrama gir!" Mən (onun əmrini) yerinə yetirdim. (Nəhayət,) Mühəssəbdə olduğumuz gecə Peyğəmbər ﷺ (qardaşım) Abdur-Rəhmanı mənimlə Tən'imə göndərdi."

Abdur-Rəhman onu tərkinə alıb (oraya) apardı və Aişə buraxdığı ümrənin yerinə yenidən ümrə niyyəti ilə ihrama girdi. Beləliklə, Allah ona həcc və ümrə ziyarətlərini yerinə yetirməyi nəsib etdi. Buna görə (kəffarə olaraq) nə qurban kəsmək, nə sədəqə vermək, nə də oruc tutmaq lazım gəldi." (əl-Buxari, 1786)

## 6-cı fəsil. Ümrənin savabı çəkilən yorğunluğa görədir

## ٦ – باب: أَجْرُ الْعُمْرَةِ عَلَى قَدْرِ النَّصَبِ

٨٧١ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: يَا رَسُولَ اللَّهِ يَصْدُرُ النَّاسُ بِنُسُكَيْنِ وَأَصْدُرُ بِنُسُكٍ فَقِيلَ لَهَا: «انْتَظِرِي، فَإِذَا طَهُرْتِ فَاخْرُجِي إِلَى التَّنْعِيمِ، فَأَهِلِّي ثُمَّ ائْتِينَا بِمَكَانِ كَذَا، وَلَكِنَّهَا عَلَى قَدْرِ نَفَقَتِكِ، أَوْ نَصَبِكِ». [رواه البخاري: ١٧٨٧]

**871.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Ya Rəsulullah, camaat iki ibadəti[1] yerinə yetirmiş olduğu halda geri qayıdır, mən isə ancaq birini yerinə yetirmiş olduğum halda geri qayıdacağam." (Peyğəmbər ﷺ) ona dedi: "Gözlə! Təmizləndikdən sonra isə Tənimə get və ümrə niyyəti ilə ihrama gir. Sonra da filan yerdə görüşərik. Fəqət sənin ümrənin savabı xərclədiklərinə və yorğunluğuna müvafiq olacaq.[2]" (əl-Buxari, 1787)

## 7-ci fəsil. Ümrəni yerinə yetirən adam nə zaman ihramdan çıxmalıdır?

## ٧– باب: مَتَى يَحِلُّ الْمُعْتَمِرُ

٨٧٢ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِى بَكْرٍ ﵄ أَنَّهَا كَانَتْ كُلَّمَا مَرَّتْ بِالْحَجُونِ تَقُولُ: صَلَّى اللَّهُ عَلَى مُحَمَّدٍ، لَقَدْ نَزَلْنَا مَعَهُ هَا هُنَا، وَنَحْنُ يَوْمَئِذٍ خِفَافٌ، قَلِيلٌ ظَهْرُنَا، قَلِيلَةٌ أَزْوَادُنَا، فَاعْتَمَرْتُ أَنَا وَأُخْتِى عَائِشَةُ وَالزُّبَيْرُ وَفُلاَنٌ وَفُلاَنٌ، فَلَمَّا مَسَحْنَا الْبَيْتَ أَحْلَلْنَا، ثُمَّ أَهْلَلْنَا مِنَ الْعَشِيِّ بِالْحَجِّ. [رواه البخاري: ١٧٩٦]

**872.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr ﵄ hər dəfə Həcun dağının yanından keçdikdə deyərdi: "Muhəmmədə Allahın salavatı olsun! Biz onunla birlikdə buraya gəldik. Həmin gün bizim əşyamız yüngül, minik heyvanımız və yol azuqəmiz az idi. Mən, bacım Aişə, Zubeyr, filankəs və filankəs ümrə ziyarətini yerinə yetirdik. Biz (ümrəni tamamlayıb) Kəbəyə toxunduqdan sonra ihramdan çıxdıq və elə həmin axşam həcc niyyəti ilə ihrama girdik." (əl-Buxari, 1796)

## 8-ci fəsil. Həccdən, ümrədən və ya döyüşdən qayıdarkən nə deyilməlidir?

## ٨– باب: مَا يَقُولُ إِذَا رَجَعَ مِنَ الْحَجِّ أَوِ الْعُمْرَةِ أَوِ الْغَزْوِ

٨٧٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﵄ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا قَفَلَ مِنْ غَزْوٍ أَوْ حَجٍّ أَوْ عُمْرَةٍ يُكَبِّرُ عَلَى كُلِّ شَرَفٍ مِنَ الأَرْضِ ثَلاَثَ تَكْبِيرَاتٍ، ثُمَّ يَقُولُ: «لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ، لَهُ الْمُلْكُ، وَلَهُ الْحَمْدُ، وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ، آيِبُونَ تَائِبُونَ عَابِدُونَ سَاجِدُونَ لِرَبِّنَا حَامِدُونَ، صَدَقَ اللَّهُ وَعْدَهُ وَنَصَرَ عَبْدَهُ وَهَزَمَ الأَحْزَابَ وَحْدَهُ». [رواه البخاري: ١٧٩٧]

**873.** Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ döyüşdən, həcdən və ya ümrədən qayıdarkən (yol üstü) hər dəfə yüksəkliyə qalxdıqda üç dəfə təkbir gətirər, sonra da deyərdi: "Lə ilahə illəllahu vəhdəhu lə şərikə ləh, ləhul-mulku və ləhul-həmdu və huvə alə kulli şeyin qədir. Ayibunə, taibunə, abidunə, sacidunə li Rabbinə hamidun. Sədəqallahu və'dəhu, və nəsəra abdəhu və həzəməl-əhzabə vəhdəhu.[3]" (əl-Buxari, 1797)

---

[1] Burada həcc və ümrə ziyarətləri nəzərdə tutulur.

[2] Yəni, "nə qədər pul xərcləsən və nə qədər əziyyət çəksən, o qədər də savab qazanacaqsan".

[3] Tərcüməsi: Allahdan başqa məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Mülk Onundur və həmd Ona məxsusdur! O hər şeyə Qadirdir. (Biz) geri dönənlər, tövbə edənlər, ibadət edənlər, səcdə edənlər və Rəbbimizə həmd edənlərik! Allah vədinə sadiq oldu, quluna kömək etdi və (düşmənlərdən olan) dəstələri tək Özü məğlub etdi!

**9-cu fəsil.** (Ziyarətə) **gələn hacıları qarşılamaq və üç nəfərin bir minik üstündə oturması**

**٩- باب: اسْتِقْبَالُ الْحَاجِّ الْقَادِمِينَ وَالثَّلاثَةُ عَلَى الدَّابَّةِ**

٨٧٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: لَمَّا قَدِمَ النَّبِيُّ ﷺ مَكَّةَ اسْتَقْبَلَتْهُ أُغَيْلِمَةُ بَنِى عَبْدِ الْمُطَّلِبِ، فَحَمَلَ وَاحِدًا بَيْنَ يَدَيْهِ وَآخَرَ خَلْفَهُ. [رواه البخاري: ١٧٩٨]

**874.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Məkkəyə gəldikdə onu Bəni Abdul-Muttəlib qəbiləsindən olan uşaqlar qarşıladı. O, uşaqlardan (ikisini tərkinə alıb) birini önündə, o birisini isə arxasında otuzdurdu." (əl-Buxari, 1798)

**10-cu fəsil.** (Səfərdən qayıdan adamın) **gecə vaxtı** (evinə) **gəlməsi**

**١٠- باب: الدُّخُولُ بِالْعَشِيِّ**

٨٧٥ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: كَانَ النَّبِيُّ ﷺ لاَ يَطْرُقُ أَهْلَهُ، كَانَ لاَ يَدْخُلُ إِلاَّ غُدْوَةً أَوْ عَشِيَّةً. [رواه البخاري: ١٨٠٠]

**875.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ (səfərdən qayıdarkən) gecə vaxtı ailəsinin yanına getməzdi, ancaq səhər, ya da axşam üstü gedərdi." (əl-Buxari, 1800)

٨٧٦ – عَنْ جَابِرٍ رضي الله عنه قَالَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ يَطْرُقَ أَهْلَهُ لَيْلاً. [رواه البخاري: ١٨٠١]

**876.** Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ (səfərdən qayıdan) adamın gecə vaxtı ailəsinin yanına gəlməsini qadağan etmişdir." (əl-Buxari, 1801)

**11-ci fəsil. Mədinəyə yaxınlaşdıqda dəvəsini tez sürüb gedən kimsə haqqında**

**١١- باب: مَنْ أَسْرَعَ نَاقَتَهُ إِذَا بَلَغَ الْمَدِينَةَ**

٨٧٧ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا قَدِمَ مِنْ سَفَرٍ، فَأَبْصَرَ دَرَجَاتِ الْمَدِينَةِ أَوْضَعَ نَاقَتَهُ، وَإِنْ كَانَتْ دَابَّةً حَرَّكَهَا. وَ زَادَ فِي رِوَايَةٍ: حَرَّكَهَا مِنْ حُبِّهَا. [رواه البخاري: ١٨٠٢]

**877.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: " Peyğəmbər ﷺ səfərdən qayıtdığı zaman Mədinənin yollarını görəndə dəvəsini tez sürüb gedər, habelə başqa bir minik üzərində olduqda da onu qovardı."
(Haris) əlavə edib demişdir: "...onu sevdiyinə görə belə edərdi." (əl-Buxari, 1802)

**12-ci fəsil. Səfər əzabın bir parçasıdır**

**١٢- باب: السَّفَرُ قِطْعَةٌ مِنَ الْعَذَابِ**

٨٧٨ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ: «السَّفَرُ قِطْعَةٌ مِنَ الْعَذَابِ، يَمْنَعُ أَحَدَكُمْ طَعَامَهُ وَشَرَابَهُ وَنَوْمَهُ، فَإِذَا قَضَى نَهْمَتَهُ فَلْيُعَجِّلْ إِلَى أَهْلِهِ». [رواه البخاري: ١٨٠٤]

**878.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Səfər əzabın bir parçasıdır. O, hər birinizi yeməyindən, içməyindən və yatmağından qoyur. Hər kim öz tələbatını ödəmişdirsə, ailəsinin yanına tələssin!" (əl-Buxari, 1804)

# ٢٨ – كِتَابُ الْمُحْصَرِ

# 28 – Saxlanılan adam[1] haqqında kitab

## ١ – باب: إِذَا أُحْصِرَ الْمُعْتَمِرُ

## 1-ci fəsil. Ümrəyə gedənin yolunu kəsərlərsə, (o nə etməlidir)?

٨٧٩ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَدْ أُحْصِرَ رَسُولُ اللَّهِ ﷺ فَحَلَقَ رَأْسَهُ وَجَامَعَ نِسَاءَهُ، وَنَحَرَ هَدْيَهُ، حَتَّى اعْتَمَرَ عَامًا قَابِلاً. [رواه البخاري: ١٨٠٩]

**879.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "(Müşriklər) Peyğəmbərin ﷺ yolunu kəsmişdilər (deyə) o, başını qırxdırdı, qadınları ilə yaxınlıq etdi və qurbanlıq heyvanını kəsdi. Nəhayət, növbəti il ümrə ziyarətini yerinə yetirdi." (əl-Buxari, 1809)

## ٢ – باب: الإِحْصَارُ فِي الْحَجِّ

## 2-ci fəsil. Həcc əsnasında saxlanılmaq

٨٨٠ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ كَانَ يَقُولُ: أَلَيْسَ حَسْبُكُمْ سُنَّةَ رَسُولِ اللَّهِ ﷺ؟ إِنْ حُبِسَ أَحَدُكُمْ عَنِ الْحَجِّ طَافَ بِالْبَيْتِ وَبِالصَّفَا وَالْمَرْوَةِ، ثُمَّ حَلَّ مِنْ كُلِّ شَيْءٍ، حَتَّى يَحُجَّ عَامًا قَابِلاً، فَيُهْدِي أَوْ يَصُومُ، إِنْ لَمْ يَجِدْ هَدْيًا. [رواه البخاري: ١٨١٠]

**880.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbərin ﷺ sünnəsi sizə bəs etmirmi? Hansı birinizə (vaxtında) həcci yerinə yetirməyə mane olsalar, (Məkkəyə gəlib çatdığı vaxt) Kəbəni təvaf etsin, Səfa və Mərvə arasında səy etsin, sonra da tam şəkildə ihramdan çıxsın; nəhayət, sonrakı il həcci yerinə yetirsin və qurban kəssin; qurban tapa bilməsə, oruc tutsun." (əl-Buxari, 1810)

## ٣ – باب: النَّحْرُ قَبْلَ الْحَلْقِ فِي الْحَصْرِ

## 3-cü fəsil. (Ziyarətdən) saxlanıldıqda başı qırxdırmamışdan əvvəl qurban kəsmək

٨٨١ – عَنْ الْمِسْوَرِ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَحَرَ قَبْلَ أَنْ يَحْلِقَ، وَأَمَرَ أَصْحَابَهُ بِذَلِكَ. [رواه البخاري: ١٨١١]

**881.** Misvar رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ (başını) qırxdırmamışdan əvvəl qurban kəsmiş və əshabələrinə də bunu əmr etmişdir." (əl-Buxari, 1811)

[1] Burada həcc və ya ümrə niyyəti ilə ihrama girən adamın ziyarətə buraxılmaması nəzərdə tutulur.

## 4-cü fəsil. Uca Allahın: «...ya sədəqə verməli...» sözü: “altı kasıbı yedizdirmək” deməkdir

## ٤ – باب: قَوْلُ اللَّه تَعَالَى: ﴿أَوۡ صَدَقَةٍ﴾ وَهِىَ إِطْعَامُ سِتَّة مَسَاكِينَ

٨٨٢ – عَنْ كَعْبِ بْنِ عُجْرَةَ ﷺ قَالَ: وَقَفَ عَلَيَّ رَسُولُ اللَّهِ ﷺ بِالْحُدَيْبِيَة، وَرَأْسِى يَتَهَافَتُ قَمْلاً فَقَالَ: «يُؤْذِيكَ هَوَامُّكَ». قُلْتُ نَعَمْ. قَالَ: «فَاحْلِقْ رَأْسَكَ – أَوْ قَالَ – احْلِقْ». قَالَ فِيَّ نَزَلَتْ هَذِه الآيَةُ ﴿فَمَن كَانَ مِنكُم مَّرِيضًا أَوۡ بِهِۦٓ أَذٗى مِّن رَّأۡسِهِۦ﴾ إِلَى آخِرِهَا. فَقَالَ النَّبِىُّ ﷺ: «صُمْ ثَلاَثَةَ أَيَّامٍ، أَوْ تَصَدَّقْ بِفَرَقٍ بَيْنَ سِتَّة، أَوِ انْسُكْ بِمَا تَيَسَّرَ». [رواه البخاري: ١٨١٥]

**882.** Rəvayət edilir ki, Kəb ibn Ucra ﷺ demişdir: “Hudeybiyədə Peyğəmbər ﷺ mənim başımın üstə dayandı və başımdan bitlər töküldüyünü (görüb) soruşdu: “Bitlər sənə əziyyət verirmi?” Mən: “Bəli”– deyə cavab verdim. O (mənə): “Başını qırxdır!”– deyə buyurdu və mənim barəmdə bu ayə nazil oldu: “Sizlərdən xəstələnən və ya başındakı *xəstəlikdən* əziyyət çəkən varsa, fidyə olaraq ya oruc tutmalı, ya sədəqə verməli, ya da qurban kəsməlidir.”[1] Sonra Peyğəmbər ﷺ (ayəni izah edib) dedi: “Ya üç gün oruc tut, ya altı kasıbı yedizdir, ya da imkanın çatan qurbanı kəs.” (əl-Buxari, 1815)

## 5-ci fəsil. Fidyə olaraq verilən yemək yarım saa[2] olmalıdır

## ٥ – باب: الإِطْعَامُ فِى الْفِدْيَة نِصْفُ صَاعٍ

٨٨٣ – وَعَنْهُ ﷺ فِي رِوَايَةٍ قَالَ: نَزَلَتْ فِيَّ خَاصَّةً، وَهِىَ لَكُمْ عَامَّةً. [رواه البخاري: ١٨١٦]

**883.** Digər rəvayətdə (Kəb ibn Ucra ﷺ) demişdir: “Bu ayə mənə görə nazil olmuş olsa da, sizin hamınıza aid edilir.” (əl-Buxari, 1816)

---

[1] “əl-Bəqərə” surəsi, 196.
[2] 152-ci hədisin qeydlərinə bax.

# ٢٩ – كِتَابُ جَزَاءِ الصَّيْدِ

# 29 – Ov etməyin cəzası kitabı

## ١ – باب: إِذَا صَادَ الْحَلاَلُ فَأَهْدَى لِلْمُحْرِمِ الصَّيْدَ أَكَلَه

## 1-ci fəsil. İhramda olmayan adam ov edib ovladığı heyvanı ihramda olan adama versə, sonuncusuna bunu yemək (halal olar)

٨٨٤ – عَنْ أَبِي قَتَادَةَ ﵁ قَالَ: انْطَلَقْنَا مَعَ النَّبِيِّ ﷺ عَامَ الْحُدَيْبِيَةِ فَأَحْرَمَ أَصْحَابُهُ، وَلَمْ أُحْرِمْ أَنَا، فَأُنْبِئْنَا بِعَدُوٍّ بِغَيْقَةَ، فَتَوَجَّهْنَا نَحْوَهُمْ، فَبَصُرَ أَصْحَابِي بِحِمَارِ وَحْشٍ، فَجَعَلَ بَعْضُهُمْ يَضْحَكُ إِلَى بَعْضٍ، فَنَظَرْتُ فَرَأَيْتُهُ، فَحَمَلْتُ عَلَيْهِ الْفَرَسَ، فَطَعَنْتُهُ فَأَثْبَتُّهُ، فَاسْتَعَنْتُهُمْ، فَأَبَوْا أَنْ يُعِينُونِي، فَأَكَلْنَا مِنْ لَحْمِهِ، فَطَلَبْتُ النَّبِيَّ ﷺ وَخَشِينَا أَنْ نُقْتَطَعَ، أَرْفَعُ فَرَسِي شَأْوًا، وَأَسِيرُ عَلَيْهِ شَأْوًا، فَلَقِيتُ رَجُلاً مِنْ بَنِي غِفَارٍ فِي جَوْفِ اللَّيْلِ فَقُلْتُ: أَيْنَ تَرَكْتَ النَّبِيَّ ﷺ؟ قَالَ: تَرَكْتُهُ بِتَعْهِنَ، وَهُوَ قَائِلٌ السُّقْيَا. فَلَحِقْتُ رَسُولَ اللَّهِ ﷺ حَتَّى أَتَيْتُهُ فَقُلْتُ: يَا رَسُولَ اللَّهِ إِنَّ أَصْحَابَكَ أَرْسَلُوا يَقْرَءُونَ عَلَيْكَ السَّلاَمَ وَرَحْمَةَ اللَّهِ، إِنَّهُمْ قَدْ خَشُوا أَنْ يُقْتَطَعُوا الْعَدُوُّ دُونَكَ، فَانْتَظِرْهُمْ، فَفَعَلَ قُلْتُ: يَا رَسُولَ اللَّهِ إِنَّا اصَّدْنَا حِمَارَ وَحْشٍ، وَعِنْدَنَا مِنْهُ فَاضِلَةٌ. فَقَالَ لِلْقَوْمِ «كُلُوا» وَهُمْ مُحْرِمُونَ. [رواه البخاري: ١٨٢١]

**884.** Rəvayət edilir ki, Əbu Qətadə ﵁ demişdir: “Hudeybiyə ilində biz Peyğəmbərlə ﷺ birlikdə (Məkkəyə) yola düşdük. Bu əsnada əshabələr ihrama girdi, mən isə ihrama girmədim. Bizə düşmənin Ğeyqədə[1] olduğunu xəbər verdilər və biz onlara tərəf yollandıq. (Yolda) mənim dostlarım vəhşi eşşək görüb gülüşdülər. Mən onu gördükdə atımı ona tərəf sürdüm və ona bir zərbə endirib onu tutdum. Mən dostlarımı köməyə çağırdım, lakin onlar mənə kömək etməkdən boyun qaçırdılar. Biz onun ətini (bişirib) yedikdən sonra mən Peyğəmbərə ﷺ çatmaq üçün (atımı tez sürüb) getdim. Biz camaatdan ayrı düşəcəyimizdən ehtiyat edirdik. Mən atımı hərdən dördnala çapır, hərdən də asta sürürdüm. Gecənin bir aləmində Bəni Ğifar qəbiləsindən olan bir nəfərə rast gəldim və (ondan): “Peyğəmbəri ﷺ harada qoyub gəlmisən?”- deyə soruşdum. O dedi: “Mən Təhində[2] ondan ayrıldım; o, günorta dincəlmək üçün Suqyada[3] dayanmışdı. Mən onun arxasınca gedib ona çatdım və dedim: “Ya Rəsulullah, əshabələrin sənə salam söyləyir və Allahdan sənin üçün mərhəmət diləyirlər. Onlar düşmənlə (qarşılaşıb) səndən ayrı düşəcəklərindən ehtiyat edirlər. Onları da gözlə.” (Peyğəmbər ﷺ onları) gözlədi. Mən: “Ya Rəsulullah, biz vəhşi eşşək ovlamışıq və onun ətindən bizdə bir qədər qalıb”- dedim. Əshabələr ihramda ikən Peyğəmbər ﷺ onlara: “Yeyin!”- deyə buyurdu.” (əl-Buxari, 1821)

---

[1] Məkkə ilə Mədinə arasında yerləşən və Bəni Ğifar qəbiləsinə məxsus quyu.

[2] Quyu və ya bulaq adıdır.

[3] Məkkə ilə Mədinə arasında yerləşən bir kənddir.

## 2-ci fəsil. İhramda olan adam ihramda olmayan kimsənin ov etməsinə kömək göstərməməlidir

## ٢ – باب: لاَ يُعِينُ الْمُحْرِمُ الْحَلاَلَ فِى قَتْلِ الصَّيْدِ

٨٨٥ – وَ عَنْهُ فِي رِوَايَةٍ قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ بِالْقَاحَةِ مِنَ الْمَدِينَةِ عَلَى ثَلاَثٍ، وَمِنَّا الْمُحْرِمُ، وَمِنَّا غَيْرُ الْمُحْرِمِ، فَذَكَرَ الحَدِيثَ. [رواه البخاري: ١٨٢٣]

**885.** Digər bir rəvayətdə (Əbu Qətadə ﷺ) demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Mədinənin üç keçidliyində[1] olan Qahə vadisində idik. Aramızdan kimisi ihramda idi, kimisi də ihramda deyildi...." (əl-Buxari, 1823)

## 3-cü fəsil. İhramda olan adam, ihramda olmayan kimsənin ov etməsi üçün ovlanılacaq heyvanı ona göstərməməlidir

## ٣ – باب: لاَ يُشِيرُ الْمُحْرِمُ إِلَى الصَّيْدِ لِكَىْ يَصْطَادَهُ الْحَلاَلُ

٨٨٦ – وَ عَنْهُ فِي رِوَايَةٍ: فَلَمَّا أَتَوْا رَسُولَ اللَّهِ ﷺ قَالَ: «أَمِنْكُمْ أَحَدٌ أَمَرَهُ أَنْ يَحْمِلَ عَلَيْهَا، أَوْ أَشَارَ إِلَيْهَا». قَالُوا لاَ، قَالَ: «فَكُلُوا مَا بَقِىَ مِنْ لَحْمِهَا». [رواه البخاري: ١٨٢٤]

**886.** Başqa bir rəvayətdə (Əbu Qətadə ﷺ) demişdir: "(Dostlarım) Peyğəmbərin ﷺ yanına gəldikdə o (onlardan) soruşdu: "Aranızdan kimsə ona bu vəhşi eşşəyə hücum etməyi əmr etmişdirmi? Yaxud ona işarə etmişdirmi?" Onlar: "Xeyr!"– deyə cavab verdilər. (Onda) Peyğəmbər ﷺ buyurdu: "Elə isə ətin qalanını da yeyin!" (əl-Buxari, 1824)

## 4-cü fəsil. Kimsə ihrama girmiş bir adama vəhşi bir eşşək hədiyyə edərsə, bunu ondan qəbul etməməlidir

## ٤ – باب: إِذَا أَهْدَى لِلْمُحْرِمِ حِمَارًا وَحْشِيًّا حَيًّا لَمْ يَقْبَلْ

٨٨٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبَّاسٍ ﷺ عَنِ الصَّعْبِ بْنِ جَثَّامَةَ اللَّيْثِىِّ ﷺ أَنَّهُ أَهْدَى لِرَسُولِ اللَّهِ ﷺ حِمَارًا وَحْشِيًّا، وَهُوَ بِالأَبْوَاءِ أَوْ بِوَدَّانَ فَرَدَّهُ عَلَيْهِ، فَلَمَّا رَأَى مَا فِى وَجْهِهِ قَالَ: «إِنَّا لَمْ نَرُدَّهُ عَلَيْكَ إِلاَّ أَنَّا حُرُمٌ». [رواه البخاري: ١٨٢٥]

**887.** Abdullah ibn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Əbvada (və ya Vəddanda)[2] olarkən Sab ibn Cəssamə əl-Leysi ona vəhşi bir eşşək hədiyyə elədi. Peyğəmbər ﷺ bu (hədiyyəni) onun özünə qaytardı. Peyğəmbər ﷺ onun üzündə kədər hissi olduğunu görəndə dedi: "Biz onu sənə ancaq ihramda olduğumuza görə qaytardıq." (əl-Buxari, 1825)

---

[1] Bir keçid 40 kilometrə bərabərdir.

[2] Əbva Mədinənin cənub-qərbində, Məkkə yolunun üstündə yerləşən şəhərdir. Vəddan isə Əbvanın yaxınlığındakı bir yerdir.

## ٥– باب: مَا يَقْتُلُ الْمُحْرِمُ فِي الْحَرَمِ

## 5-ci fəsil. İhramda olan adam nəyi öldürə bilər?

٨٨٨ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «خَمْسٌ مِنَ الدَّوَابِّ كُلُّهُنَّ فَاسِقٌ، يَقْتُلُهُنَّ فِى الْحَرَمِ الْغُرَابُ وَالْحِدَأَةُ وَالْعَقْرَبُ وَالْفَأْرَةُ وَالْكَلْبُ الْعَقُورُ». [رواه البخاري: ١٨٢٩]

**888.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Beş (növ) heyvan vardır ki, bunlar ziyanvericidirlər və onları haram sayılan ərazidə öldürmək olar: qarğa, çalağan, əqrəb, siçan və quduz it." (əl-Buxari, 1829)

٨٨٩ – عَنْ عَبْدِ اللَّهِ رضي الله عنه قَالَ بَيْنَمَا نَحْنُ مَعَ النَّبِيِّ ﷺ فِى غَارٍ بِمِنًى، إِذْ نَزَلَ عَلَيْهِ ﴿وَالْمُرْسَلَاتِ﴾ وَإِنَّهُ لَيَتْلُوهَا، وَإِنِّى لأَتَلَقَّاهَا مِنْ فِيهِ، وَإِنَّ فَاهُ لَرَطْبٌ بِهَا، إِذْ وَثَبَتْ عَلَيْنَا حَيَّةٌ فَقَالَ النَّبِيُّ ﷺ: «اقْتُلُوهَا». فَابْتَدَرْنَاهَا، فَذَهَبَتْ، فَقَالَ النَّبِيُّ ﷺ: «وُقِيَتْ شَرَّكُمْ كَمَا وُقِيتُمْ شَرَّهَا». [رواه البخاري: ١٨٣٠]

**889.** Rəvayət edilir ki, Abdullah (ibn Məsud) رضي الله عنه demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Minadakı mağarada olarkən ona: "And olsun xeyirlə göndərilənlərə..."[1] surəsi nazil oldu və o, bu surəni oxumağa başladı. Mən bu surəni onun ağzından eşidib əzbərləyirdim. O, surəni oxuyarkən birdən bizim üstümüzə bir ilan atıldı və Peyğəmbər ﷺ: "Öldürün onu!"– deyə əmr etdi. Biz ilanı öldürmək istədikdə o qaçdı. Peyğəmbər ﷺ dedi: "Siz onun şərindən qorunduğunuz kimi, o da sizin şərinizdən qorundu." (əl-Buxari, 1830)

٨٩٠ – عَنْ عَائِشَةَ رضي الله عنها زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ لِلْوَزَغِ: «فُوَيْسِقٌ». وَلَمْ أَسْمَعْهُ أَمَرَ بِقَتْلِهِ. [رواه البخاري: ١٨٣١]

**890.** Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ kərtənkələni "xırda ziyanverici" adlandırdı. Mən onun kərtənkələni öldürməyə dair əmr verdiyini eşitməmişəm. (əl-Buxari, 1831)

## ٦– باب: لاَ يَحِلُّ الْقِتَالُ بِمَكَّةَ

## 6-cı fəsil. Məkkədə vuruşmaq halal deyildir

٨٩١ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ النَّبِيُّ ﷺ يَوْمَ افْتَتَحَ مَكَّةَ: «لاَ هِجْرَةَ وَلَكِنْ جِهَادٌ وَنِيَّةٌ، وَإِذَا اسْتُنْفِرْتُمْ فَانْفِرُوا...». [رواه البخاري: ١٨٣٤]

**891.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Məkkənin fəthi günü demişdir: "(Bu gündən etibarən artıq) hicrət etməyə lüzum yoxdur. Lakin cihad etmək və niyyət vardır. Əgər sizi cihada çağırsalar, tələsin!" (əl-Buxari, 1834)

## ٧– باب: الْحِجَامَةُ لِلْمُحْرِمِ

## 7-ci fəsil. İhramda olan adamın qan aldırması

٨٩٢ – عَنِ ابْنِ بُحَيْنَةَ رضي الله عنه قَالَ: احْتَجَمَ النَّبِيُّ ﷺ وَهُوَ مُحْرِمٌ بِلَحْيِ جَمَلٍ فِى وَسَطِ رَأْسِهِ. [رواه البخاري: ١٨٣٦]

[1] "əl-Mursəlat" surəsi.

**892.** Rəvayət edilir ki, ibn Buheynə ﵁ demişdir: "Peyğəmbər ﷺ ihramda olduğu halda Ləhyi Cəməldə[1] ikən başının ortasından qan aldırdı." (əl-Buxari, 1836)

## 8-ci fəsil. İhramda olan adamın evlənməsi

## ٨- باب: تَزْوِيجُ الْمُحْرِمِ

٨٩٣ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ أَنَّ النَّبِيَّ ﷺ تَزَوَّجَ مَيْمُونَةَ وَهُوَ مُحْرِمٌ. [رواه البخاري: ١٨٣٧]

**893.** İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ ihramda ikən Meymunə ilə evləndi. (əl-Buxari, 1837)

## 9-cu fəsil. İhramda olan adamın qüsl etməsi

## ٩- باب: الاغْتِسَالُ لِلْمُحْرِمِ

٨٩٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ حُنَيْنٍ أَنَّ عَبْدَ اللَّهِ بْنَ الْعَبَّاسِ وَالْمِسْوَرَ بْنَ مَخْرَمَةَ ﵄ اخْتَلَفَا بِالأَبْوَاءِ، فَقَالَ عَبْدُ اللَّهِ بْنُ عَبَّاسٍ يَغْسِلُ الْمُحْرِمُ رَأْسَهُ. وَقَالَ الْمِسْوَرُ لاَ يَغْسِلُ الْمُحْرِمُ رَأْسَهُ. فَأَرْسَلَنِي عَبْدُ اللَّهِ بْنُ الْعَبَّاسِ إِلَى أَبِي أَيُّوبَ الأَنْصَارِيِّ، فَوَجَدْتُهُ يَغْتَسِلُ بَيْنَ الْقَرْنَيْنِ، وَهُوَ يُسْتَرُ بِثَوْبٍ، فَسَلَّمْتُ عَلَيْهِ فَقَالَ مَنْ هَذَا فَقُلْتُ أَنَا عَبْدُ اللَّهِ بْنُ حُنَيْنٍ، أَرْسَلَنِي إِلَيْكَ عَبْدُ اللَّهِ بْنُ الْعَبَّاسِ، أَسْأَلُكَ كَيْفَ كَانَ رَسُولُ اللَّهِ ﷺ يَغْسِلُ رَأْسَهُ، وَهُوَ مُحْرِمٌ، فَوَضَعَ أَبُو أَيُّوبَ يَدَهُ عَلَى الثَّوْبِ، فَطَأْطَأَهُ حَتَّى بَدَا لِي رَأْسُهُ ثُمَّ قَالَ لإِنْسَانٍ يَصُبُّ عَلَيْهِ اصْبُبْ. فَصَبَّ عَلَى رَأْسِهِ، ثُمَّ حَرَّكَ رَأْسَهُ بِيَدَيْهِ فَأَقْبَلَ بِهِمَا وَأَدْبَرَ وَقَالَ هَكَذَا رَأَيْتُهُ ﷺ يَفْعَلُ. [رواه البخاري: ١٨٤٠]

**894.** Abdullah ibn Huneyn rəvayət edir ki, Əbva deyilən yerdə Abdullah ibn Abbasla Misvar ibn Məxrəmə arasında fikir ayrılığı düşdü. Abdullah ibn Abbas: "İhramda olan adam başını yuya bilər"– deyir, Misvar ibn Məxrəmə ﵁ isə: "Yuya bilməz"– deyirdi. Onda Abdullah ibn Abbas məni Əbu Əyyub əl-Ənsarinin ﵁ yanına göndərdi. Mən gedib onu iki sütun arasında paltarı pərdə tutub qüsl etdiyini gördüm. Mən ona salam verdim və o: "Kimdir?"– deyə soruşdu. Dedim: "Mənəm – Abdullah ibn Huneyn. Abdullah ibn Abbas məni sənin yanına göndərib ki, Peyğəmbərin ﷺ ihramda ikən başını necə yuduğunu səndən soruşum." Onda Əbu Əyyub əli ilə paltardan tutub onu (o qədər) aşağı saldı ki, mən onun başını gördüm. Sonra onun başına su tökən adama: "Tök"– dedi. Adam onun başına su tökdü və o, əllərini qabağa və dala apararaq başını yudu və dedi: "Mən Peyğəmbərin ﷺ belə etdiyini gördüm." (əl-Buxari, 1840)

## 10-cu fəsil. İhrama girməyən adamın haram sayılan əraziyə və Məkkəyə daxil olması

## ١٠- باب: دُخُولُ الْحَرَمِ وَمَكَّةَ بِغَيْرِ إِحْرَامٍ

٨٩٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ دَخَلَ عَامَ الْفَتْحِ، وَعَلَى رَأْسِهِ الْمِغْفَرُ، فَلَمَّا نَزَعَهُ جَاءَ رَجُلٌ، فَقَالَ إِنَّ ابْنَ خَطَلٍ مُتَعَلِّقٌ بِأَسْتَارِ الْكَعْبَةِ. فَقَالَ: «اقْتُلُوهُ». [رواه البخاري: ١٨٤٦]

[1] Məkkə ilə Mədinə arasında yer.

**895.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ zəfər ilində[1] (Məkkəyə) daxil olduqda başında dəbilqə var idi. O, dəbilqəni başından çıxartdıqda bir nəfər gəlib dedi: "İbn Xətəl Kəbənin örtüyündən yapışıb[2] (aman diləyir)." Peyğəmbər ﷺ: "Öldürün onu!"– deyə buyurdu. (əl-Buxari, 1846)

## ١١– باب: الْحَجُّ وَالنُّذُورُ عَنِ الْمَيِّتِ، وَالرَّجُلُ يَحُجُّ عَنِ الْمَرْأَةِ

## 11-ci fəsil. Ölən adamın yerinə həcc etmək və onun əvəzinə nəzir vermək; kişi qadının yerinə həcc edə bilər

٨٩٦ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ امْرَأَةً مِنْ جُهَيْنَةَ جَاءَتْ إِلَى النَّبِيِّ ﷺ فَقَالَتْ إِنَّ أُمِّي نَذَرَتْ أَنْ تَحُجَّ، فَلَمْ تَحُجَّ حَتَّى مَاتَتْ أَفَأَحُجُّ عَنْهَا قَالَ: «نَعَمْ، حُجِّي عَنْهَا، أَرَأَيْتِ لَوْ كَانَ عَلَى أُمِّكِ دَيْنٌ أَكُنْتِ قَاضِيَةً اقْضُوا اللَّهَ، فَاللَّهُ أَحَقُّ بِالْوَفَاءِ». [رواه البخاري: ١٨٥٢]

**896.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Cuheynə qəbiləsindən olan bir qadın Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Anam həccə getməyi nəzir etmiş, lakin ölüm onu haqlayanadək həccə gedə bilməmişdir. Mən onun yerinə həcc edə bilərəmmi?" Peyğəmbər ﷺ dedi: "Bəli, onun əvəzinə həcci yerinə yetir! De görüm, əgər ananın borcu olsaydı, onu ödəyərdinmi? Allaha olan borcunuzu ödəyin! Borcu ödənməyə ən çox haqqı olan Allahdır." (əl-Buxari, 1852)

## ١٢– باب: حَجُّ الصِّبْيَانِ

## 12-ci fəsil. Uşaqların həcci yerinə yetirməsi

٨٩٧ – عَنْ السَّائِبِ بْنِ يَزِيدَ رضي الله عنه قَالَ: حُجَّ بِي مَعَ رَسُولِ اللَّهِ ﷺ وَأَنَا ابْنُ سَبْعِ سِنِينَ. [رواه البخاري: ١٨٥٨]

**897.** Rəvayət edilir ki, Saib ibn Yezid ﷺ demişdir: "Mən Peyğəmbərlə ﷺ birlikdə həcc ziyarətinə getdikdə mənim yeddi yaşım var idi." (əl-Buxari, 1858)

## ١٣– باب: حَجُّ النِّسَاءِ

## 13-cü fəsil. Qadınların həcci yerinə yetirməsi

٨٩٨ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: لَمَّا رَجَعَ النَّبِيُّ ﷺ مِنْ حَجَّتِهِ قَالَ لِأُمِّ سِنَانٍ الْأَنْصَارِيَّةِ: «مَا مَنَعَكِ مِنَ الْحَجِّ». قَالَتْ أَبُو فُلَانٍ - تَعْنِي زَوْجَهَا - كَانَ لَهُ نَاضِحَانِ، حَجَّ عَلَى أَحَدِهِمَا، وَالْآخَرُ يَسْقِي أَرْضًا لَنَا. قَالَ: «فَإِنَّ عُمْرَةً فِي رَمَضَانَ تَقْضِي حَجَّةً مَعِي». [رواه البخاري: ١٨٦٣]

---

[1] Burada hicrətin səkkizinci ili – Məkkənin fəth edildiyi il nəzərdə tutulur.

[2] Bu adam bir zamanlar İslam dinini qəbul etmiş, sonra da Peyğəmbər ﷺ onu ənsardan olan iki əshabə ilə birlikdə zəkat yığmağa göndərmişdir. Lakin o, naxələflik edib əshabəni öldürmüş və dinindən dönərək küfrə qayıtmışdır. Bundan əlavə onun oxuyan iki kənizi var imiş ki, bu kənizlər öz mahnıları ilə Peyğəmbəri ﷺ ələ salırlarmış. Elə bu səbəbdən də Peyğəmbər ﷺ onu və onun kənizlərini öldürməyi əmr etmişdir.

**898.** Rəvayət edilir ki, ibn Abbas ﵄ demişdir: "Peyğəmbər ﷺ həcc ziyarətindən qayıtdıqda Ummu Sinan əl-Ənsariyyəyə dedi: "Sənə həccə getməyə nə mane oldu?" Qadın öz ərini qəsd edərək: "Əbu filankəs (mane oldu)"- dedi. Onun cəmi iki dəvəsi var idi. Birində özü həccə getmiş, digərini isə əkin sahəsini sulamaq üçün saxlamışdır." Peyğəmbər ﷺ dedi: "Ramazanda ümrə ziyarəti (etsən), mənimlə həcc ziyarətini yerinə yetirmiş olarsan." (əl-Buxari, 1863)

٨٩٩ – عَنْ أَبِي سَعِيد ﷺ وَقَدْ غَزَا مَعَ النَّبِيِّ ﷺ ثِنْتَىْ عَشْرَةَ غَزْوَةً قَالَ: أَرْبَعٌ سَمِعْتُهُنَّ مِنْ رَسُولِ اللَّهِ ﷺ فَأَعْجَبْنَنِى وَآنَقْنَنِى: «أَنْ لاَ تُسَافِرَ امْرَأَةٌ مَسِيرَةَ يَوْمَيْنِ لَيْسَ مَعَهَا زَوْجُهَا أَوْ ذُو مَحْرَمٍ، وَلاَ صَوْمَ يَوْمَيْنِ الْفِطْرِ وَالأَضْحَى، وَلاَ صَلاَةَ بَعْدَ صَلاَتَيْنِ بَعْدَ الْعَصْرِ حَتَّى تَغْرُبَ الشَّمْسُ، وَبَعْدَ الصُّبْحِ حَتَّى تَطْلُعَ الشَّمْسُ، وَلاَ تُشَدُّ الرِّحَالُ إِلاَّ إِلَى ثَلاَثَةِ مَسَاجِدَ مَسْجِدِ الْحَرَامِ، وَمَسْجِدِى، وَمَسْجِدِ الأَقْصَى». [رواه البخاري: ١٨٦٤]

**899.** Rəvayət edilir ki, Peyğəmbərlə ﷺ birlikdə on iki döyüşdə iştirak etmiş Əbu Səid ﷺ demişdir: "Peyğəmbərdən ﷺ eşitdiyim bu dörd şey məni təəccübləndirmiş və mənim xoşuma gəlmişdir:

– qadın, yanında əri və ya məhrəmi olmadan iki günlük səfərə çıxmamalıdır;

– orucluq və qurban bayramlarında oruc tutmaq olmaz;

– iki namazdan sonra – əsr namazından sonra ta gün batanadək və sübh namazından sonra ta gün çıxanadək namaz qılmaq olmaz;

– üç məsciddən – Məscidülhəramdan, mənim məscidimdən və Məscidüləqsadan – başqa heç bir yerə (ibadət məqsədilə) səfərə getmək olmaz." (əl-Buxari, 1864)

## 14-cü fəsil. Kəbəyə piyada getməyi nəzir edən kimsə haqqında

## ١٤ – باب: مَنْ نَذَرَ الْمَشْىَ إِلَى الْكَعْبَةِ

٩٠٠ – عَنْ أَنَسٍ ﷺ أَنَّ النَّبِىَّ ﷺ رَأَى شَيْخًا يُهَادَى بَيْنَ ابْنَيْهِ قَالَ: «مَا بَالُ هَذَا». قَالُوا نَذَرَ أَنْ يَمْشِىَ، قَالَ: «إِنَّ اللَّهَ عَنْ تَعْذِيبِ هَذَا نَفْسَهُ لَغَنِىٌّ». وَأَمَرَهُ أَنْ يَرْكَبَ. [رواه البخاري: ١٨٦٥]

**900.** Ənəs ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ ixtiyar bir qocanın oğlanlarının qoluna girib getdiyini görüb: "Ona nə olub?"– deyə soruşdu. (Qocanın) oğlanları dedilər: "O, (Məkkəyə) piyada getməyi nəzir etmişdir." Peyğəmbər ﷺ: "Allah onun öz canına əziyyət verməyinə möhtac deyildir"– dedi və ona miniyə minməyi əmr etdi. (əl-Buxari, 1865)

٩٠١ – عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ﷺ قَالَ: نَذَرَتْ أُخْتِى أَنْ تَمْشِىَ إِلَى بَيْتِ اللَّهِ، وَأَمَرَتْنِى أَنْ أَسْتَفْتِىَ لَهَا النَّبِىَّ ﷺ فَاسْتَفْتَيْتُهُ، فَقَالَ عَلَيْهِ السَّلاَمُ: «لِتَمْشِ وَلْتَرْكَبْ». [رواه البخاري: ١٨٦٦]

**901.** Rəvayət edilir ki, Uqbə ibn Amir ﷺ demişdir: "Bir vaxt mənim bacım Allahın Evinə piyada getməyi nəzir etdi və mənə Peyğəmbərdən ﷺ bunun hökmünü soruşmağı əmr etdi. Mən (bu haqda) Peyğəmbərdən ﷺ soruşduqda o dedi: "Qoy həm piyada, həm də minik üstündə getsin!" (əl-Buxari, 1866)

# ٣٠ – كِتَابُ فَضَائِلِ الْمَدِينَةِ

# 30 – Mədinənin üstünlükləri kitabı

## ١– باب: حَرَمُ الْمَدِينَةِ

## 1-ci fəsil. Mədinənin haram sayılan ərazisi[1]

٩٠٢ – عَنْ أَنَسٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «الْمَدِينَةُ حَرَمٌ، مِنْ كَذَا إِلَى كَذَا، لاَ يُقْطَعُ شَجَرُهَا، وَلاَ يُحْدَثُ فِيهَا حَدَثٌ، مَنْ أَحْدَثَ حَدَثًا فَعَلَيْهِ لَعْنَةُ اللَّهِ وَالْمَلاَئِكَةِ وَالنَّاسِ أَجْمَعِينَ». [رواه البخاري: ١٨٦٧]

**902.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Filan yerdən filan yerədək Mədinənin haram sayılan ərazisidir. Orada nə ağac kəsmək, nə də günah iş görmək (və ya bidət etmək) olmaz. Kim (orada) günah iş görərsə, ona Allahın, mələklərin və bütün insanların lənəti olar." (əl-Buxari, 1867)

٩٠٣ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «حُرِّمَ مَا بَيْنَ لاَبَتَيِ الْمَدِينَةِ عَلَى لِسَانِى». قَالَ وَأَتَى النَّبِيُّ ﷺ بَنِى حَارِثَةَ فَقَالَ: «أَرَاكُمْ يَا بَنِى حَارِثَةَ قَدْ خَرَجْتُمْ مِنَ الْحَرَمِ». ثُمَّ الْتَفَتَ، فَقَالَ: «بَلْ أَنْتُمْ فِيهِ». [رواه البخاري: ١٨٦٩]

**903.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mədinənin bu – qaralmış daş-kəsəklərlə dolu iki sahəsinin arası mənim dilim vasitəsilə haram sayılan ərazi elan edilmişdir."

Peyğəmbər ﷺ Bəni Harisə qəbiləsinə gəlib dedi: "Ey Bəni Harisə, görürəm ki, siz haram sayılan ərazidən kənara çıxmısınız." Sonra o ətrafına göz gəzdirib dedi: "Yox, yox, siz bu ərazinin daxilindəsiniz." (əl-Buxari, 1869)

٩٠٤ – عَنْ عَلِيٍّ ﷺ قَالَ مَا عِنْدَنَا شَىْءٌ إِلاَّ كِتَابُ اللَّهِ، وَهَذِهِ الصَّحِيفَةُ عَنِ النَّبِيِّ ﷺ: «الْمَدِينَةُ حَرَمٌ، مَا بَيْنَ عَائِرٍ إِلَى كَذَا، مَنْ أَحْدَثَ فِيهَا حَدَثًا، أَوْ آوَى مُحْدِثًا، فَعَلَيْهِ لَعْنَةُ اللَّهِ وَالْمَلاَئِكَةِ وَالنَّاسِ أَجْمَعِينَ، لاَ يُقْبَلُ مِنْهُ صَرْفٌ وَلاَ عَدْلٌ». وَقَالَ: «ذِمَّةُ الْمُسْلِمِينَ وَاحِدَةٌ، فَمَنْ أَخْفَرَ مُسْلِمًا فَعَلَيْهِ لَعْنَةُ اللَّهِ وَالْمَلاَئِكَةِ وَالنَّاسِ أَجْمَعِينَ، لاَ يُقْبَلُ مِنْهُ صَرْفٌ وَلاَ عَدْلٌ، وَمَنْ تَوَلَّى قَوْمًا بِغَيْرِ إِذْنِ مَوَالِيهِ، فَعَلَيْهِ لَعْنَةُ اللَّهِ وَالْمَلاَئِكَةِ وَالنَّاسِ أَجْمَعِينَ، لاَ يُقْبَلُ مِنْهُ صَرْفٌ وَلاَ عَدْلٌ». [رواه البخاري: ١٨٧٠]

**904.** Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Bizim əlimizdə Allahın Kitabından və Peyğəmbərin ﷺ (hədisləri yazılmış) bu səhifələrdən başqa bir şey yoxdur. (Həmin səhifələrdə bu sözlər yazılmışdır:) "Air dağı ilə filan yerin[2] arası haram sayılan ərazidir. Kim (orada) günah iş görsə və ya günahkar adama sığınacaq versə, ona Allahın, mələklərin və bütün insanların lənəti olar; ondan nə vacib əməllər, nə də nafilə ibadətləri[3] qəbul olunar. Müsəlmanların (kafirə) aman verməsi birdir[4]. Kim müsəlmanla bağladığı əhdini pozsa, ona Allahın, mələklərin və

---

[1] Elə bir müqəddəs yer ki, orada müharibə etmək qadağan edilmişdir.

[2] Filan yer deyildikdə Uhud dağının arxa tərəfində yerləşən kiçik dağ nəzərdə tutulur. Mədinə əhli bu dağa Sövr dağı deyirlər. "Əvnul-Məbud", 6/12; 2032-ci hədisin şərhi.

[3] Yəni, onun namaz, oruc və başqa bu kimi yerinə yetirdiyi vacib əməlləri və əlavə olaraq etdiyi ibadətləri qəbul olunmaz.

[4] Bir müsəlmanın kafirə aman verməsi, bütün müsəlmanların ona aman verməsi deməkdir. 231-ci hədisə bax.

bütün insanların lənəti olar; ondan nə vacib əməllər, nə də nafilə ibadətləri qəbul olunar. Kim ağasının izni olmadan başqalarının onun ağası olduğunu iddia etsə, ona Allahın, mələklərin və bütün insanların lənəti olar; ondan nə vacib əməllər, nə də nafilə ibadətləri qəbul olunar." (əl-Buxari, 1870)

## 2-ci fəsil. Mədinənin fəziləti və (pis) adamları özündən kənarlaşdırması

## ٢ – باب: فَضْلُ الْمَدِينَةِ، وَأَنَّهَا تَنْفِي النَّاسَ

٩٠٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أُمِرْتُ بِقَرْيَةٍ تَأْكُلُ الْقُرَى يَقُولُونَ يَثْرِبُ. وَهِيَ الْمَدِينَةُ، تَنْفِي النَّاسَ كَمَا يَنْفِي الْكِيرُ خَبَثَ الْحَدِيدِ». [رواه البخاري: ١٨٧١]

**905.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənə başqa şəhərləri üstələyən bir şəhərə – Yəsrib adlanan yerə (hicrət etmək) əmr olundu. Ora Mədinədir. Körük[1] dəmirin pasını tökdüyü kimi, (Mədinə də pis) adamları özündən kənar edir." (əl-Buxari, 1871)

## 3-cü fəsil. Mədinə Tabədir[2]

## ٣– باب: الْمَدِينَةُ طَابَة

٩٠٦ – عَنْ أَبِي حُمَيْدٍ ﵁ أَقْبَلْنَا مَعَ النَّبِيِّ ﷺ مِنْ تَبُوكَ حَتَّى أَشْرَفْنَا عَلَى الْمَدِينَةِ فَقَالَ: «هَذِهِ طَابَةُ». [رواه البخاري: ١٨٧٢]

**906.** Rəvayət edilir ki, Əbu Humeyd ﵁ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Təbukdan qayıdarkən Mədinəyə gəlib çatdıqda o: "Bura Tabədir!"– dedi." (əl-Buxari, 1872)

## 4-cü fəsil. Mədinəni sevməyən kimsələr

## ٤– باب: مَنْ رَغِبَ عَنِ الْمَدِينَةِ

٩٠٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «يَتْرُكُونَ الْمَدِينَةَ عَلَى خَيْرِ مَا كَانَتْ، لاَ يَغْشَاهَا إِلاَّ الْعَوَافِ – يُرِيدُ عَوَافِيَ السِّبَاعِ وَالطَّيْرِ – وَآخِرُ مَنْ يُحْشَرُ رَاعِيَانِ مِنْ مُزَيْنَةَ، يُرِيدَانِ الْمَدِينَةَ يَنْعِقَانِ بِغَنَمِهِمَا، فَيَجِدَانِهَا وَحْشًا، حَتَّى إِذَا بَلَغَا ثَنِيَّةَ الْوَدَاعِ خَرَّا عَلَى وُجُوهِهِمَا». [رواه البخاري: ١٨٧٤]

**907.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Mədinənin ən gözəl vaxtlarında[3] insanlar onu tərk edəcəklər. (O zaman) orada yırtıcı heyvanlardan və quşlardan başqa bir kimsə qalmayacaq. Mədinəyə ayaq basanların ən sonuncusu Muzeynə qəbiləsindən olan iki çoban olacaq. Onlar öz qoyunlarını haylayaraq Mədinəyə gəlib onun boş qaldığını görəcəklər. Nəhayət, onlar gəlib vida vadisinə çatdıqda üzüqoylu yerə yıxılacaqlar." (əl-Buxari, 1874)

---

[1] Kürədə odu qızartmaq üçün və s. məqsədlər üçün yanları büküşlü dəri və taxtadan düzəldilmiş alət. Dəmirçi körüyü.

[2] Mədinə şəhərinin adlarından biri. 753-cü hədisin qeydlərinə bax.

[3] Bu hadisə Qiyamətə yaxın bir zamanda baş verəcək.

٩٠٨ – عَنْ سُفْيَانَ بْنِ أَبِى زُهَيْرٍ ﷺ أَنَّهُ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّه ﷺ يَقُولُ: «تُفْتَحُ الْيَمَنُ فَيَأْتِى قَوْمٌ يُبِسُّونَ، فَيَتَحَمَّلُونَ بِأَهْلِيهِمْ وَمَنْ أَطَاعَهُمْ، وَالْمَدِينَةُ خَيْرٌ لَهُمْ لَوْ كَانُوا يَعْلَمُونَ، وَتُفْتَحُ الشَّأْمُ، فَيَأْتِى قَوْمٌ يُبِسُّونَ فَيَتَحَمَّلُونَ بِأَهْلِيهِمْ وَمَنْ أَطَاعَهُمْ، وَالْمَدِينَةُ خَيْرٌ لَهُمْ لَوْ كَانُوا يَعْلَمُونَ، وَتُفْتَحُ الْعِرَاقُ، فَيَأْتِى قَوْمٌ يُبِسُّونَ فَيَتَحَمَّلُونَ بِأَهْلِيهِمْ وَمَنْ أَطَاعَهُمْ. وَالْمَدِينَةُ خَيْرٌ لَهُمْ لَوْ كَانُوا يَعْلَمُونَ». [رواه البخاري: ١٨٧٥]

**908.** Rəvayət edilir ki, Sufyan ibn Əbu Zuheyr ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Yəmən fəth ediləcək və bəzi insanlar öz ailələrini və onlara itaət edənləri götürüb ora köçəcəklər. Halbuki Mədinə onlar üçün daha xeyirlidir. Kaş bilərdilər! Şam fəth ediləcək və bəzi insanlar öz ailələrini və onlara itaət edənləri götürüb ora köçəcəklər. Halbuki Mədinə onlar üçün daha xeyirlidir. Kaş bilərdilər! İraq fəth ediləcək və bəzi insanlar öz ailələrini və onlara itaət edənləri götürüb ora köçəcəklər. Halbuki Mədinə onlar üçün daha xeyirlidir. Kaş bilərdilər! (əl-Buxari, 1875)

## 5-ci fəsil. İman Mədinəyə yığışacaq

## ٥– باب: الإِيمَانُ يَأْرِزُ إِلَى الْمَدِينَةِ

٩٠٩ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِنَّ الإِيمَانَ لَيَأْرِزُ إِلَى الْمَدِينَةِ كَمَا تَأْرِزُ الْحَيَّةُ إِلَى جُحْرِهَا». [رواه البخاري: ١٨٧٦]

**909.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İlan qayıdıb öz yuvasına girdiyi kimi, iman da Mədinəyə yığışacaq.[1]” (əl-Buxari, 1876)

## 6-cı fəsil. Mədinə əhlinə qarşı pislik etmək istəyənlərin günahı

## ٦– باب: إِثْمُ مَنْ كَادَ أَهْلَ الْمَدِينَةِ

٩١٠ – عَنْ سَعْدٍ ﷺ قَالَ سَمِعْتُ النَّبِىَّ ﷺ يَقُولُ: «لاَ يَكِيدُ أَهْلَ الْمَدِينَةِ أَحَدٌ إِلاَّ انْمَاعَ كَمَا يَنْمَاعُ الْمِلْحُ فِى الْمَاءِ». [رواه البخاري: ١٨٧٧]

**910.** Səd ﷺ rəvayət etmişdir ki, mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Mədinə əhlinə pislik etmək istəyən hər kəs, duz suda əridiyi kimi əriyəcəkdir[2]”. (əl-Buxari, 1877)

## 7-ci fəsil. Mədinə qalaları

## ٧– باب: آطَامُ الْمَدِينَةِ

٩١١ – عَنْ أُسَامَةَ ﷺ قَالَ أَشْرَفَ النَّبِىُّ ﷺ عَلَى أُطُمٍ مِنْ آطَامِ الْمَدِينَةِ فَقَالَ: «هَلْ تَرَوْنَ مَا أَرَى إِنِّى لأَرَى مَوَاقِعَ الْفِتَنِ خِلاَلَ بُيُوتِكُمْ كَمَوَاقِعِ الْقَطْرِ». [رواه البخاري: ١٨٧٨]

---

[1] Möminlər Peyğəmbərə ﷺ və onun şəhərinə olan məhəbbətdən dolayı hər zaman oraya yığışmağa çalışıb, çalışır və çalışacaqlar da.

[2] İmam Muslimin rəvayət etdiyi hədis bu hədisi açıqlayır. Hədisdə Peyğəmbər ﷺ demişdir: “Mədinə əhlinə pislik etmək istəyən hər kəsi, Allah, – qurğuşun əridiyi kimi və ya duz suda həll olduğu kimi – Cəhənnəm odunda əridəcəkdir.”

**911.** Rəvayət edilir ki, Üsamə ﷺ demişdir: “Peyğəmbər ﷺ Mədinə qalalarından birinin üstünə çıxıb dedi: “Mənim gördüklərimi görürsünüzmü? Həqiqətən, mən yağış dənələrinin (düşdüyü) yerlər qədər, evlərinizin arasına düşən fütnələrin yerlərini görürəm.” (əl-Buxari, 1878)

## ٨– باب: لاَ يَدْخُلُ الدَّجَّالُ الْمَدِينَةَ

## 8-ci fəsil. Dəccal Mədinəyə girməyəcək

٩١٢ – عَنْ أَبِى بَكْرَةَ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لاَ يَدْخُلُ الْمَدِينَةَ رُعْبُ الْمَسِيحِ الدَّجَّالِ، لَهَا يَوْمَئِذٍ سَبْعَةُ أَبْوَابٍ، عَلَى كُلِّ بَابٍ مَلَكَانِ». [رواه البخاري: ١٨٧٩]

**912.** Əbu Bəkrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Məsih-dəccal qorxusu Mədinəyə girməyəcəkdir. Həmin gün Mədinənin yeddi qapısı olacaq və hər qapısında iki (gözətçi) mələk duracaq.” (əl-Buxari, 1879)

٩١٣ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «عَلَى أَنْقَابِ الْمَدِينَةِ مَلاَئِكَةٌ، لاَ يَدْخُلُهَا الطَّاعُونُ وَلاَ الدَّجَّالُ». [رواه البخاري: ١٨٨٠]

**913.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mədinənin girəcəklərində (gözətçi) mələklər vardır. (Odur ki,) ora nə taun, nə də dəccal girə bilər.” (əl-Buxari, 1880)

٩١٤ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لَيْسَ مِنْ بَلَدٍ إِلاَّ سَيَطَؤُهُ الدَّجَّالُ، إِلاَّ مَكَّةَ وَالْمَدِينَةَ، لَيْسَ لَهُ مِنْ نِقَابِهَا نَقْبٌ إِلاَّ عَلَيْهِ الْمَلاَئِكَةُ صَافِّينَ، يَحْرُسُونَهَا، ثُمَّ تَرْجُفُ الْمَدِينَةُ بِأَهْلِهَا ثَلاَثَ رَجَفَاتٍ، فَيُخْرِجُ اللَّهُ كُلَّ كَافِرٍ وَمُنَافِقٍ». [رواه البخاري: ١٨٨١]

**914.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Elə bir şəhər qalmayacaq ki, dəccal ora girməsin. Yalnız Məkkə və Mədinədən başqa. (Bu şəhərlərin) girişlərindən hər birində səf-səf düzülmüş halda keşik çəkən mələklər olacaq. Sonra Mədinə öz sakinlərini üç dəfə silkələyəcək və beləliklə də, Allah hər bir kafiri və münafiqi (oradan) çıxardacaqdır.” (əl-Buxari, 1881)

٩١٥ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِىِّ ﷺ قَالَ: حَدَّثَنَا رَسُولُ اللَّهِ ﷺ حَدِيثًا طَوِيلاً عَنِ الدَّجَّالِ، فَكَانَ فِيمَا حَدَّثَنَا بِهِ أَنْ قَالَ: «يَأْتِى الدَّجَّالُ – وَهُوَ مُحَرَّمٌ عَلَيْهِ أَنْ يَدْخُلَ نِقَابَ الْمَدِينَةِ – بَعْضَ السِّبَاخِ الَّتِى بِالْمَدِينَةِ، فَيَخْرُجُ إِلَيْهِ يَوْمَئِذٍ رَجُلٌ، هُوَ خَيْرُ النَّاسِ – أَوْ مِنْ خَيْرِ النَّاسِ – فَيَقُولُ أَشْهَدُ أَنَّكَ الدَّجَّالُ، الَّذِى حَدَّثَنَا عَنْكَ رَسُولُ اللَّهِ ﷺ حَدِيثَهُ، فَيَقُولُ الدَّجَّالُ أَرَأَيْتَ إِنْ قَتَلْتُ هَذَا ثُمَّ أَحْيَيْتُهُ، هَلْ تَشُكُّونَ فِى الأَمْرِ فَيَقُولُونَ لاَ. فَيَقْتُلُهُ، ثُمَّ يُحْيِيهِ فَيَقُولُ حِينَ يُحْيِيهِ وَاللَّهِ مَا كُنْتُ قَطُّ أَشَدَّ بَصِيرَةً مِنِّى الْيَوْمَ، فَيَقُولُ الدَّجَّالُ أَقْتُلُهُ فَلاَ أُسَلَّطُ عَلَيْهِ». [رواه البخاري: ١٨٨٢]

**915.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: “Peyğəmbər ﷺ dəccal barəsində bizə uzun bir hədis danışdı. Onun bizə danışdıqları bu idi ki: “Dəccala Mədinəyə girmək qadağan olduğu bir vaxtda o gəlib Mədinənin kənarındakı şoranlıqda dayanacaq. Həmin vaxt ən xeyirli insan (və ya xeyirli insanlardan biri) onun yanına gəlib deyəcək: “Mən şahidlik edirəm ki, sən, Peyğəmbərin ﷺ

sənin barəndə bizə xəbər verdiyi dəccalsan." Dəccal (yanındakılara) deyəcək: "Deyin görüm, əgər mən bu adamı öldürüb sonra diriltsəm, mənim (tanrı) olduğuma şübhə edəcəksinizmi?" Onlar: "Xeyr!"– deyə cavab verəcəklər. Dəccal onu öldürüb sonra diriləcəkdir. Onu diriltdikdən sonra (həmin adam) deyəcək: "Vallahi, (sənin yalançı olduğuna dair) bu günə kimi heç vaxt mənim belə qəti inamım olmamışdır." Onda dəccal deyəcək: "Mən onu (yenə) öldürərdim, lakin bunu edə bilməyəcəyəm." (əl-Buxari, 1882)

## ٩- باب: الْمَدِينَةُ تَنْفِي الْخَبَثَ

## 9-cu fəsil. Mədinə pis şeyləri kənar edir

٩١٦ – عَنْ جَابِرٍ ﷺ جَاءَ أَعْرَابِيٌّ النَّبِيَّ ﷺ فَبَايَعَهُ عَلَى الإِسْلاَمِ، فَجَاءَ مِنَ الْغَدِ مَحْمُومًا، فَقَالَ أَقِلْنِي، فَأَبَى ثَلاَثَ مِرَارٍ، فَقَالَ: «الْمَدِينَةُ كَالْكِيرِ، تَنْفِي خَبَثَهَا، وَيَنْصَعُ طَيِّبُهَا». [رواه البخاري: ١٨٨٣]

**916.** Cabir ﷺ rəvayət edir ki, bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib müsəlman olacağına dair ona beyət etdi. Ertəsi gün isə həyəcan içində gəlib dedi: "Məni (bu sıxıntıdan) qurtar." (O adam bunu) üç dəfə təkrar etdi, lakin Peyğəmbər ﷺ imtina etdi və dedi: "Mədinə körük kimidir: pisləri özündən kənar edir, yaxşıları isə təmizə çıxarır." (əl-Buxari, 1883)

## ١٠- باب

## 10-cu fəsil

٩١٧ – عَنْ أَنَسٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «اللَّهُمَّ اجْعَلْ بِالْمَدِينَةِ ضِعْفَيْ مَا جَعَلْتَ بِمَكَّةَ مِنَ الْبَرَكَةِ». [رواه البخاري: ١٨٨٥]

**917.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahım, Məkkəyə nazil etdiyin bərəkətin iki qatını Mədinəyə nazil et!" (əl-Buxari, 1885)

## ١١- باب

## 11-ci fəsil

٩١٨ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: لَمَّا قَدِمَ رَسُولُ اللَّهِ ﷺ الْمَدِينَةَ وُعِكَ أَبُو بَكْرٍ وَبِلاَلٌ، فَكَانَ أَبُو بَكْرٍ إِذَا أَخَذَتْهُ الْحُمَّى يَقُولُ:

كُلُّ امْرِئٍ مُصَبَّحٌ فِي أَهْلِهِ وَالْمَوْتُ أَدْنَى مِنْ شِرَاكِ نَعْلِهِ

وَكَانَ بِلاَلٌ إِذَا أُقْلِعَ عَنْهُ الْحُمَّى يَرْفَعُ عَقِيرَتَهُ يَقُولُ:

أَلاَ لَيْتَ شِعْرِي هَلْ أَبِيتَنَّ لَيْلَةً بِوَادٍ وَحَوْلِي إِذْخِرٌ وَجَلِيلُ؟
وَهَلْ أَرِدَنْ يَوْمًا مِيَاهَ مَجَنَّةٍ وَهَلْ يَبْدُوَنْ لِي شَامَةٌ وَطَفِيلُ؟

قَالَ: اللَّهُمَّ الْعَنْ شَيْبَةَ بْنَ رَبِيعَةَ، وَعُتْبَةَ بْنَ رَبِيعَةَ، وَأُمَيَّةَ بْنَ خَلَفٍ، كَمَا أَخْرَجُونَا مِنْ أَرْضِنَا إِلَى أَرْضِ الْوَبَاءِ ثُمَّ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «اللَّهُمَّ حَبِّبْ إِلَيْنَا الْمَدِينَةَ كَحُبِّنَا مَكَّةَ أَوْ أَشَدَّ، اللَّهُمَّ بَارِكْ لَنَا فِي صَاعِنَا، وَفِي مُدِّنَا، وَصَحِّحْهَا لَنَا وَانْقُلْ حُمَّاهَا إِلَى الْجُحْفَةِ». قَالَتْ وَقَدِمْنَا الْمَدِينَةَ، وَهِيَ أَوْبَأُ أَرْضِ اللَّهِ. قَالَتْ فَكَانَ بُطْحَانُ يَجْرِي نَجْلاً. تَعْنِي مَاءً آجِنًا. [رواه البخاري: ١٨٨٩]

**918.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ Mədinəyə gəldikdə Əbu Bəkr və Bilal xəstələnmişdilər. Əbu Bəkrin qızdırması qalxanda deyərdi:

*Hər kəs səhər oyanar ailəsində yuxudan,*
*Ölüm yaxın olar ona çəkməsinin bağından.*

Bilalın da hər qızdırması azalanda səsini qaldırıb deyərdi:

*Nə olaydı biləydim bir gün qalacağammı?*
*Vadidə ətrafımda izxir*[1]*, cəlil*[2] *olacaqmı?*
*Məcənnənin*[3] *sularına bir gün yetişəcəyəmmi?*
*Şama, Təfil*[4] *dağları gözümə görünəcəklərmi?*

Peyğəmbər ﷺ dedi: "Allahım, bizi torpağımızdan çıxardıb vəba xəstəliyi olan torpağa qovan Şeybə ibn Rəbiəyə, Utbə ibn Rəbiəyə və Umeyyə ibn Xələfə lənət et!"

Sonra Peyğəmbər ﷺ (yenə dua edib) dedi: "Allahım, Məkkəni bizə sevdirdiyin kimi, yaxud bundan artıq bir sevgiylə Mədinəni də bizə sevdir. Bizim bir ovuc və dörd ovuc yeməyimizə bərəkət ver. Bu yerləri xəstəliklərdən azad et. Oradakı qızdırma xəstəliyini Cuhfəyə yönəlt!"

Aişə demişdir: "Biz Mədinəyə gəldikdə ora yer üzünün ən çox vəba xəstəliyi olan yeri idi. Buthandan axan sular isə başdan-başa xəstəlik idi." (əl-Buxari, 1889)

[1] İzxir – ətirli qamış.
[2] Cəlil – nazik gövdəli ev bitkisi.
[3] Məcənnə – Məkkədən bir neçə mil aralıda yerləşən ərazi.
[4] Şama və Təfil – Məkkə yaxınlığında iki dağ.

# ٣١ – كِتَابُ الصَوْمِ

# 31 – Oruc kitabı

## ١– باب: فَضْلُ الصَّوْمِ

## 1-ci fəsil. Orucun fəziləti

٩١٩ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «الصِّيَامُ جُنَّةٌ، فَلاَ يَرْفُثْ وَلاَ يَجْهَلْ، وَإِنِ امْرُؤٌ قَاتَلَهُ أَوْ شَاتَمَهُ فَلْيَقُلْ إِنِّى صَائِمٌ. مَرَّتَيْنِ، وَالَّذِى نَفْسِى بِيَدِهِ لَخُلُوفُ فَمِ الصَّائِمِ أَطْيَبُ عِنْدَ اللَّهِ تَعَالَى مِنْ رِيحِ الْمِسْكِ، يَتْرُكُ طَعَامَهُ وَشَرَابَهُ وَشَهْوَتَهُ مِنْ أَجْلِى، الصِّيَامُ لِى، وَأَنَا أَجْزِى بِهِ، وَالْحَسَنَةُ بِعَشْرِ أَمْثَالِهَا». [رواه البخاري: ١٨٩٤]

**919.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Oruc bir qalxandır.[1] Qoy (oruc tutan adam) günah işlər görməsin və cahillik etməsin. Əgər kimsə onunla dalaşmaq istəsə və ya onu söysə, qoy iki dəfə: “Mən oruc tutmuşam”– desin. Canım Əlində olan Allaha and olsun ki, oruc tutan adamın ağzından gələn qoxu, Uca Allahın yanında müşk qoxusundan daha gözəldir. (Allah buyurur:) “O, Mənə görə öz yeməyindən, içməyindən və şəhvətindən imtina etmişdir. Oruc isə Mənim üçündür və Mən (oruc tutan adama) ayrıca mükafat verəcəyəm. Yaxşı əməlin əvəzi on qat veriləcəkdir.” (əl-Buxari, 1894)

## ٢– باب: الرَّيَّانُ لِلصَّائِمِينَ

## 2-ci fəsil. Rəyyan (qapısı) oruc tutanlar üçündür

٩٢٠ – عَنْ سَهْلٍ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «إِنَّ فِى الْجَنَّةِ بَابًا يُقَالُ لَهُ الرَّيَّانُ، يَدْخُلُ مِنْهُ الصَّائِمُونَ يَوْمَ الْقِيَامَةِ، لاَ يَدْخُلُ مِنْهُ أَحَدٌ غَيْرُهُمْ يُقَالُ أَيْنَ الصَّائِمُونَ فَيَقُومُونَ، لاَ يَدْخُلُ مِنْهُ أَحَدٌ غَيْرُهُمْ، فَإِذَا دَخَلُوا أُغْلِقَ، فَلَمْ يَدْخُلْ مِنْهُ أَحَدٌ». [رواه البخاري: ١٨٩٦]

**920.** Səhl ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cənnətdə Rəyyan adlı bir qapı var, Qiyamət günü bu qapıdan oruc tutanlar daxil olacaqlar, onlardan başqa heç kəs bu qapıdan keçə bilməyəcək, (o gün): “Oruc tutanlar haradadır?”– deyiləcək və oruc tutanlar ayağa qalxacaqlar, onlardan başqa heç kəs bu qapıdan keçə bilməyəcək, onlar içəri daxil olduqdan sonra (qapılar) bağlanacaq və (bundan sonra) heç kəs o qapıdan (Cənnətə) daxil ola bilməyəcək.” (əl-Buxari, 1896)

٩٢١ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَنْ أَنْفَقَ زَوْجَيْنِ فِى سَبِيلِ اللَّهِ نُودِىَ مِنْ أَبْوَابِ الْجَنَّةِ يَا عَبْدَ اللَّهِ، هَذَا خَيْرٌ. فَمَنْ كَانَ مِنْ أَهْلِ الصَّلاَةِ دُعِىَ مِنْ بَابِ الصَّلاَةِ، وَمَنْ كَانَ مِنْ أَهْلِ الْجِهَادِ دُعِىَ مِنْ بَابِ الْجِهَادِ، وَمَنْ كَانَ مِنْ أَهْلِ الصِّيَامِ دُعِىَ مِنْ بَابِ الرَّيَّانِ، وَمَنْ كَانَ مِنْ أَهْلِ الصَّدَقَةِ دُعِىَ مِنْ بَابِ الصَّدَقَةِ». فَقَالَ أَبُو بَكْرٍ ﷺ بِأَبِى أَنْتَ وَأُمِّى يَا رَسُولَ اللَّهِ، مَا عَلَى مَنْ دُعِىَ مِنْ تِلْكَ الأَبْوَابِ مِنْ ضَرُورَةٍ، فَهَلْ يُدْعَى أَحَدٌ مِنْ تِلْكَ الأَبْوَابِ كُلِّهَا قَالَ: «نَعَمْ، وَأَرْجُو أَنْ تَكُونَ مِنْهُمْ». [رواه البخاري: ١٨٩٧]

[1] Yəni, Cəhənnəm odundan qoruyan sipər.

**921.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim (malından) Allah yolunda iki şey xərcləsə, onu Cənnət qapılarının birindən çağırıb: "Ey Allahın qulu, bu bir xeyirdir"– deyəcəklər. Namaz qılanlar namaz qapısından, cihad edənlər cihad qapısından, oruc tutanlar Rəyyan adlı qapıdan, sədəqə verənlər də sədəqə qapısından (Cənnətə) çağırılacaqlar." (Bu vaxt) Əbu Bəkr dedi: "Atam-anam sənə fəda olsun, ya Rəsulullah! Bu qapılardan çağırılanların heç bir sıxıntı keçirməyəcəkləri bəllidir. Bəs bu qapıların hamısından çağırılan bir kimsə olacaqmı?" Peyğəmbər ﷺ dedi: "Bəli və mən ümid edirəm ki, sən onlardan olacaqsan." (əl-Buxari, 1897)

## 3-cü fəsil. "Ramazan", yoxsa "ramazan ayı" deyilməlidir? Hər iki ifadəni düzgün sayan kimsə haqqında

## ٣– باب: هَلْ يُقَالُ رَمَضَانُ أَوْ شَهْرُ رَمَضَانَ وَمَنْ رَأَى كُلَّهُ وَاسِعًا

٩٢٢ – عَنْهُ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِذَا جَاءَ رَمَضَانُ فُتِحَتْ أَبْوَابُ الْجَنَّةِ». [رواه البخاري: ١٨٩٨]

**922.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ramazan gəldiyi zaman Cənnətin qapıları açılır." (əl-Buxari, 1898)

٩٢٣ – عَنْهُ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِذَا دَخَلَ شَهْرُ رَمَضَانَ فُتِّحَتْ أَبْوَابُ السَّمَاءِ، وَغُلِّقَتْ أَبْوَابُ جَهَنَّمَ، وَسُلْسِلَتِ الشَّيَاطِينُ». [رواه البخاري: ١٨٩٩]

**923.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ramazan ayı yetişdiyi zaman göyün qapıları açılır, Cəhənnəmin qapıları qapadılır və şeytanlara zəncir vurulur." (əl-Buxari, 1899)

٩٢٤ – عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِذَا رَأَيْتُمُوهُ فَصُومُوا، وَإِذَا رَأَيْتُمُوهُ فَأَفْطِرُوا، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَاقْدُرُوا لَهُ». يَعْنِي هِلاَلَ رَمَضَانَ. [رواه البخاري: ١٩٠٠]

**924.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Hilalı[1] gördüyünüz zaman oruc tutun və hilalı[2] gördüyünüz zaman orucu saxlayın. Hava buludlu olduğu zaman hilalı görməsəniz, ayı hesablayaraq təyin edin."

Burada o, Ramazan hilalını qəsd edirdi. (əl-Buxari, 1900)

## 4-cü fəsil. Ramazan ayında yalan danışmaqdan və bu yalana əməl etməkdən əl çəkməyən kimsə

## ٤– باب: مَنْ لَمْ يَدَعْ قَوْلَ الزُّورِ وَالْعَمَلَ بِهِ فِى رَمَضَانَ

٩٢٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ لَمْ يَدَعْ قَوْلَ الزُّورِ وَالْعَمَلَ بِهِ فَلَيْسَ لِلَّهِ حَاجَةٌ فِى أَنْ يَدَعَ طَعَامَهُ وَشَرَابَهُ». [رواه البخاري: ١٩٠٣]

[1] Ramazan ayının hilalı – yəni yeni çıxmış ay nəzərdə tutulur.
[2] Şəvval ayının hilalı nəzərdə tutulur.

**925.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim yalan danışmaqdan və bu yalana əməl etməkdən əl çəkməsə, yeməyini və içməyini tərk etməsinə Allahın ehtiyacı yoxdur.” (əl-Buxari, 1903)

## ٥– باب: هَلْ يَقُولُ إِنِّى صَائِمٌ إِذَا شُتِمَ

## 5-ci fəsil. Oruc tutan adamı söysələr o: “Mən oruc tutmuşam”– deməlidirmi?

٩٢٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «قَالَ كُلُّ عَمَلِ ابْنِ آدَمَ لَهُ إِلاَّ الصِّيَامَ، فَإِنَّهُ لِى، وَأَنَا أَجْزِى بِه. وَالصِّيَامُ جُنَّةٌ، وَإِذَا كَانَ يَوْمُ صَوْمِ أَحَدِكُمْ، فَلاَ يَرْفُثْ وَلاَ يَصْخَبْ، فَإِنْ سَابَّهُ أَحَدٌ، أَوْ قَاتَلَهُ فَلْيَقُلْ إِنِّى امْرُؤٌ صَائِمٌ. وَالَّذِى نَفْسُ مُحَمَّدٍ بِيَدِه لَخُلُوفُ فَمِ الصَّائِمِ أَطْيَبُ عِنْدَ اللَّهِ مِنْ رِيحِ الْمِسْكِ، لِلصَّائِمِ فَرْحَتَانِ يَفْرَحُهُمَا إِذَا أَفْطَرَ فَرِحَ، وَإِذَا لَقِىَ رَبَّهُ فَرِحَ بِصَوْمِه». [رواه البخاري: ١٩٠٤]

**926.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “(Allah buyurur:) “Adəm övladının orucdan başqa hər bir əməli özünə aiddir. Oruc isə Mənim üçündür və elə buna görə də Mən (oruc tutan adama) ayrıca mükafat verəcəyəm.” Oruc bir qalxandır. Sizdən biriniz oruc tutduğu zaman günah işlər görməsin və dava-dalaş salmasın. Əgər kimsə onu söysə və ya onunla dalaşmaq istəsə, qoy desin ki: “Mən oruc tutmuşam.” Muhəmmədin canı Əlində olan Allaha and olsun ki, oruc tutan adamın ağzından gələn qoxu, Allah yanında müşk qoxusundan daha gözəldir. Oruc tutan adamın iki sevinc anı vardır: orucunu açdığı iftar vaxtında sevinir; bir də Rəbbinə qovuşduğu zaman tutduğu oruca görə sevinəcəkdir.” (əl-Buxari, 1904)

## ٦– باب: الصَّوْمُ لِمَنْ خَافَ عَلَى نَفْسِهِ الْعُزُوبَةَ

## 6-cı fəsil. Subay olduğundan ehtiyat edib oruc tutan kimsə

٩٢٧ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ فَقَالَ: «مَنِ اسْتَطَاعَ الْبَاءَةَ فَلْيَتَزَوَّجْ، فَإِنَّهُ أَغَضُّ لِلْبَصَرِ وَأَحْصَنُ لِلْفَرْجِ، وَمَنْ لَمْ يَسْتَطِعْ فَعَلَيْهِ بِالصَّوْمِ، فَإِنَّهُ لَهُ وِجَاءٌ». [رواه البخاري: ١٩٠٥]

**927.** Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: “Biz Peyğəmbərlə ﷺ birlikdə olarkən o belə buyurdu: “Qoy evlənməyə imkanı olan (hər kəs) evlənsin. Çünki evlilik, gözləri və cinsiyyət üzvünü (zinadan) qoruyan ən yaxşı (səbəbdir). İmkanı olmayanlar isə oruc tutsunlar. Çünki oruc (insanın) şəhvətini soyudur.” (əl-Buxari, 1905)

## ٧– باب: قَوْلُ النَّبِيِّ ﷺ: «إِذَا رَأَيْتُمُ الْهِلاَلَ فَصُومُوا وَإِذَا رَأَيْتُمُوهُ فَأَفْطِرُوا»

## 7-ci fəsil. Peyğəmbərin ﷺ: «Ayı gördüyünüz zaman oruc tutun və ayı gördüyünüz zaman orucu saxlayın» sözü

٩٢٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «الشَّهْرُ تِسْعٌ وَعِشْرُونَ لَيْلَةً، فَلاَ تَصُومُوا حَتَّى تَرَوْهُ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَأَكْمِلُوا الْعِدَّةَ ثَلاَثِينَ». [رواه البخاري: ١٩٠٧]

**928.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ay iyirmi doqquz gecədir. Odur ki, hilalı görüncəyədək oruc tutmayın. Göy üzü buludlu olduğundan hilalı görməsəniz, (şaban ayındakı) günlərin sayını otuza çatdırın.” (əl-Buxari, 1907)

٩٢٩ – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ آلَى مِنْ نِسَائِهِ شَهْرًا، فَلَمَّا مَضَى تِسْعَةٌ وَعِشْرُونَ يَوْمًا غَدَا أَوْ رَاحَ فَقِيلَ لَهُ إِنَّكَ حَلَفْتَ أَنْ لاَ تَدْخُلَ شَهْرًا، فَقَالَ: «إِنَّ الشَّهْرَ يَكُونُ تِسْعَةً وَعِشْرِينَ يَوْمًا». [رواه البخاري: ١٩١٠]

**929.** Ummu Sələmə ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ bir ay ərzində zövcələrinə yaxınlaşmayacağına dair and içdi. İyirmi doqquz gün keçdikdən sonra səhər və ya axşam onların yanına gəldi. (Zövcələrindən biri) ona dedi: “Axı sən and içmişdin ki, bir ay bizimlə yaxınlıq etməyəcəksən?!” Peyğəmbər ﷺ dedi: “Ay iyirmi doqquz gün olmuşdur.” (əl-Buxari, 1910)

## 8-ci fəsil. Bayram ayları əskilmir[1]

## ٨ – باب: شَهْرَا عِيدٍ لاَ يَنْقُصَانِ

٩٣٠ – عَنْ أَبِي بَكْرَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ: «شَهْرَانِ لاَ يَنْقُصَانِ شَهْرَا عِيدٍ رَمَضَانُ وَذُو الْحَجَّةِ». [رواه البخاري: ١٩١٢]

**930.** Əbu Bəkrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İki ay vardır ki, bunlar əskilmirlər. Bu, bayram ayları – ramazan və zülhiccədir.” (əl-Buxari, 1192)

## 9-cu fəsil. Peyğəmbərin ﷺ: «...biz nə yazmağı, nə də hesablamağı (bacarırıq)» sözü

## ٩ – باب: قَوْلُ النَّبِيِّ ﷺ: «لاَ نَكْتُبُ وَلاَ نَحْسُبُ»

٩٣١ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ: «إِنَّا أُمَّةٌ أُمِّيَّةٌ، لاَ نَكْتُبُ وَلاَ نَحْسُبُ الشَّهْرُ هَكَذَا وَهَكَذَا». يَعْنِي مَرَّةً تِسْعَةً وَعِشْرِينَ، وَمَرَّةً ثَلاَثِينَ. [رواه البخاري: ١٩١٣]

**931.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Biz savadsız[2] bir ümmətik, nə yazmaq bilirik, nə də hesablamaq. Ay gah belə, gah da belə (olur).” Yəni hərdən iyrimi doqquz, hərdən də otuz gün olur.” (əl-Buxari, 1913)

---

[1] Əksər alimlər bunu belə izah etmişlər ki, bu aylardakı günlərin sayı istər iyirmi doqquz olsun, istərsə otuz, və ya biri iyirmi doqquz olsun, o birisi otuz, yaxud da əməl baxımından günlərin saylarından asılı olmayaraq bu ayların fəzilətindən heç bir şey əskilməz. “Fəthul-Bari”, 6/154; 1910-cu hədisin şərhi.

[2] Bu, bütün müsəlman ümmətinin savadsız olması demək deyildir. Belə ki, əshabələr arasında Əli ibn Əbu Talib ﷺ, Zeyd ibn Sabit ﷺ və digər savadlı – yazıb oxumağı bacaran əshabələr var idi. Burada Peyğəmbərin yazıb oxumaq bilməməsi nəzərdə tutulur. Uca Allah buyurur: **“İstədiyimi əzabıma düçar edirəm. Mərhəmətim isə hər şeyi əhatə edir. Mən onu *Allahdan* qorxan, zəkat verən və ayələrimizə iman gətirənlər üçün yazacağam. O kəslər ki, yanlarındakı Tövrat və İncildə haqqında yazılmış olduğunu gördükləri elçinin – yazıb-oxumaq bilməyən peyğəmbərin ardınca gedərlər. O *peyğəmbər* onlara yaxşı işlər görməyi buyurar, pis əməlləri isə qadağan edər, onlara pak şeyləri halal, murdar şeyləri isə haram edər. Onların ağır yüklərini yüngülləşdirər və onları buxovlardan xilas edər. Ona iman gətirən, onu dəstəkləyən, ona kömək edən və onunla göndərilmiş nurun ardınca gedənlər isə nicat tapanlardır.”** (əl-Əraf, 156-157)

## ١٠– باب: لاَ يَتَقَدَّمَنَّ رَمَضَانَ بِصَوْمِ يَوْمٍ وَلاَ يَوْمَيْنِ

## 10-cu fəsil. Ramazandan bir gün və ya iki gün əvvəl oruc tutulmaz

٩٣٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لاَ يَتَقَدَّمَنَّ أَحَدُكُمْ رَمَضَانَ بِصَوْمِ يَوْمٍ أَوْ يَوْمَيْنِ، إِلاَّ أَنْ يَكُونَ رَجُلٌ كَانَ يَصُومُ صَوْمَهُ فَلْيَصُمْ ذَلِكَ الْيَوْمَ». [رواه البخاري: ١٩١٤]

**932.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizlərdən heç kəs ramazandan bir gün və ya iki gün əvvəl oruc tutmasın. Fəqət, əvvəllər oruc tutan adam həmişəki qaydada[1] orucunu tuta bilər." (əl-Buxari, 1914)

## ١١– باب: قَوْلُ اللَّهِ جَلَّ ذِكْرُهُ: ﴿أُحِلَّ لَكُمْ لَيْلَةَ ٱلصِّيَامِ ٱلرَّفَثُ إِلَىٰ نِسَآئِكُمْ هُنَّ لِبَاسٌ لَّكُمْ وَأَنتُمْ لِبَاسٌ لَّهُنَّ . . .﴾

## 11-ci fəsil. Uca Allahın: «Orucluq gecəsi zövcələrinizlə yaxınlıq etmək sizə halal edildi. Onlar sizin üçün bir libas, siz də onlar üçün bir libassınız...»[2] sözü

٩٣٣ – عَنْ الْبَرَاءِ ﷺ قَالَ: كَانَ أَصْحَابُ مُحَمَّدٍ ﷺ إِذَا كَانَ الرَّجُلُ صَائِمًا، فَحَضَرَ الإِفْطَارُ، فَنَامَ قَبْلَ أَنْ يُفْطِرَ لَمْ يَأْكُلْ لَيْلَتَهُ وَلاَ يَوْمَهُ، حَتَّى يُمْسِيَ، وَإِنَّ قَيْسَ بْنَ صِرْمَةَ الأَنْصَارِيَّ كَانَ صَائِمًا، فَلَمَّا حَضَرَ الإِفْطَارُ أَتَى امْرَأَتَهُ، فَقَالَ لَهَا أَعِنْدَكِ طَعَامٌ قَالَتْ لاَ وَلَكِنْ أَنْطَلِقُ، فَأَطْلُبُ لَكَ. وَكَانَ يَوْمَهُ يَعْمَلُ، فَغَلَبَتْهُ عَيْنَاهُ، فَجَاءَتْهُ امْرَأَتُهُ، فَلَمَّا رَأَتْهُ قَالَتْ خَيْبَةً لَكَ. فَلَمَّا انْتَصَفَ النَّهَارُ غُشِيَ عَلَيْهِ، فَذُكِرَ ذَلِكَ لِلنَّبِيِّ ﷺ فَنَزَلَتْ هَذِهِ الآيَةُ: ﴿أُحِلَّ لَكُمْ لَيْلَةَ ٱلصِّيَامِ ٱلرَّفَثُ إِلَىٰ نِسَآئِكُمْ﴾ فَفَرِحُوا بِهَا فَرَحًا شَدِيدًا، وَنَزَلَتْ: ﴿وَكُلُوا۟ وَٱشْرَبُوا۟ حَتَّىٰ يَتَبَيَّنَ لَكُمُ ٱلْخَيْطُ ٱلْأَبْيَضُ مِنَ ٱلْخَيْطِ ٱلْأَسْوَدِ﴾. [رواه البخاري: ١٩١٥]

**933.** Rəvayət edilir ki, Bəra ﷺ demişdir: "Muhəmmədin ﷺ əshabələri oruc tutduqları zaman iftar etməmiş yatsaydılar, sonradan bütün gecəni və növbəti günü axşam düşənədək yemək yeməzdilər. Bir dəfə Qeys ibn Sirmə əl-Ənsari oruc tutmuşdu. Nəhayət, iftar vaxtı yetişdikdə zövcəsinin yanına gəlib ondan: "Yeməyə bir şey varmı?"– deyə soruşdu. Zövcəsi: "Yoxdur, amma bu dəqiqə gedib sənin üçün bir şey hazırlayaram"– dedi. Qeys gün ərzində çox işlədiyindən dözə bilməyib yuxuya getdi. Zövcəsi gəlib onu bu halda görəndə: "Sən ziyana uğradın"– dedi. Nəhayət, günorta olduqda Qeys huşunu itirdi. Sonra bu haqda Peyğəmbərə ﷺ xəbər verdilər və bu ayə nazil oldu: "Orucluq gecəsi zövcələrinizlə yaxınlıq etmək sizə halal edildi. Onlar sizin üçün bir libas, siz də onlar üçün bir libassınız. Allah bilir ki, siz *orucluq gecələrində zövcələrinizlə yaxınlıq etməklə* özünüzə xəyanət edirsiniz. Elə buna görə də O, tövbənizi qəbul edib sizi bağışladı. Artıq *bu gündən* onlara yaxınlaşın və Allahın sizin üçün *əzəldən* müəyyən etdiyinə nail olmağa çalışın..." Müsəlmanlar bu ayənin nazil olduğuna çox sevindilər. (Sonra) bu ayə nazil oldu: **"Dan yeri söküləndə ağ sap qara sapdan (şəfəq gecənin qaranlığından) seçilənə qədər yeyin için"**[3]. (əl-Buxari, 1915)

---

[1] Birinci və dördüncü günlər və ya günaşırı oruc tutan adamdırsa, həmin günlərdə oruc tuta bilər.
[2] "əl-Bəqərə" surəsi, 187.
[3] "əl-Bəqərə" surəsi, 187.

## 12-ci fəsil. Uca Allahın: «Dan yeri söküləndə ağ sap qara sapdan (şəfəq gecənin qaranlığından) seçilənə qədər yeyin için...»[1] sözü

١٢– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَكُلُوا وَاشْرَبُوا حَتَّىٰ يَتَبَيَّنَ لَكُمُ الْخَيْطُ الْأَبْيَضُ مِنَ الْخَيْطِ الْأَسْوَدِ مِنَ الْفَجْرِ﴾

٩٣٤ – عَنْ عَدِيِّ بْنِ حَاتِمٍ ﷺ قَالَ: لَمَّا نَزَلَتْ ﴿حَتَّىٰ يَتَبَيَّنَ لَكُمُ الْخَيْطُ الْأَبْيَضُ مِنَ الْخَيْطِ الْأَسْوَدِ﴾ عَمَدْتُ إِلَى عِقَالٍ أَسْوَدَ وَإِلَى عِقَالٍ أَبْيَضَ، فَجَعَلْتُهُمَا تَحْتَ وِسَادَتِي، فَجَعَلْتُ أَنْظُرُ فِي اللَّيْلِ، فَلاَ يَسْتَبِينُ لِي، فَغَدَوْتُ عَلَى رَسُولِ اللَّهِ ﷺ فَذَكَرْتُ لَهُ ذَلِكَ فَقَالَ: «إِنَّمَا ذَلِكَ سَوَادُ اللَّيْلِ وَبَيَاضُ النَّهَارِ». [رواه البخاري: ١٩١٦]

**934.** Rəvayət edilir ki, Adiy ibn Hatim ﷺ demişdir: "Ağ sap qara sapdan seçilənə qədər yeyin için" ayəsi nazil olduqda mən bir ağ və bir qara ip götürüb yastığımın altına qoydum və gecə boyunca bu iplərə baxdım, lakin heç bir şey ayırd edə bilmədim. Səhəri gün Peyğəmbərin ﷺ yanına gəlib nə etdiyimi ona xəbər verdim. Peyğəmbər ﷺ (mənə) dedi: "Əslində, bu, gecənin qaranlığı və gündüzün aydınlığıdır." (əl-Buxari, 1916)

## 13-cü fəsil. Səhur yeməyi[2] ilə sübh namazı arasında nə qədər vaxt qalır?

١٣– باب: قَدْرُ كَمْ بَيْنَ السَّحُورِ وَصَلاَةِ الْفَجْرِ

٩٣٥ – عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ﷺ قَالَ: تَسَحَّرْنَا مَعَ النَّبِيِّ ﷺ ثُمَّ قَامَ إِلَى الصَّلاَةِ. قُلْتُ كَمْ كَانَ بَيْنَ الأَذَانِ وَالسَّحُورِ قَالَ قَدْرُ خَمْسِينَ آيَةً. [رواه البخاري: ١٩٢١]

**935.** Rəvayət edilir ki, Zeyd ibn Sabit ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə səhur yeməyini yedik. (Yeməkdən) sonra Peyğəmbər ﷺ namaza durdu."

(Ənəs) soruşdu: "Azanla səhur yeməyi arasından nə qədər vaxt keçmişdi?" (Zeyd) dedi: "(Həmin vaxt ərzində) əlli ayə oxumaq olardı." (əl-Buxari, 1921)

## 14-cü fəsil. Müstəhəb sayılan[3] səhur yeməyinin bərəkəti

١٤– باب: بَرَكَةُ السَّحُورِ مِنْ غَيْرِ إِيجَابٍ

٩٣٦ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «تَسَحَّرُوا فَإِنَّ فِي السَّحُورِ بَرَكَةً». [رواه البخاري: ١٩٢٣]

**936.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Səhur yeməyini yeyin! Həqiqətən, səhurda bərəkət var." (əl-Buxari, 1923)

---

[1] "əl-Bəqərə" surəsi, 187.

[2] Oruc tutan müsəlmanın səhər dan yeri sökülməmişdən əvvəl yediyi yeməyə səhur yeməyi deyilir.

[3] İmam əl-Buxari bu başlıqla demək istəmişdir ki, oruc tutan adama gecənin bir vaxtı səhur yeməyinə qalxmaq vacib deyil, lakin bunda onun üçün xeyir və bərəkət vardır.

## 15-ci fəsil. Oruc tutmaq istəyən kimsənin gündüz vaxtı niyyət etməsi

## ١٥– باب: إِذَا نَوَى بِالنَّهَارِ صَوْمًا

٩٣٧ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ أَنَّ النَّبِيَّ ﷺ بَعَثَ رَجُلاً يُنَادِي فِي النَّاسِ، يَوْمَ عَاشُورَاءَ: «إِنَّ مَنْ أَكَلَ فَلْيُتِمَّ أَوْ فَلْيَصُمْ، وَمَنْ لَمْ يَأْكُلْ فَلاَ يَأْكُلْ». [رواه البخاري: ١٩٢٤]

**937.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ﷺ demişdir: "Peyğəmbər ﷺ aşura günü[1] bir nəfəri göndərdi ki, insanlara elan etsin: "Kim yemək yeyibsə, daha yeməsin (və oruc tutsun); kim də yeməyibsə, yeməsin." (əl-Buxari, 1924)

## 16-cı fəsil. Oruc tutan adamın cunub ikən səhər yuxudan oyanması

## ١٦– باب: الصَّائِمُ يُصْبِحُ جُنُبًا

٩٣٨ – عَنْ عَائِشَةَ وَأُمِّ سَلَمَةَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يُدْرِكُهُ الْفَجْرُ وَهُوَ جُنُبٌ مِنْ أَهْلِهِ، ثُمَّ يَغْتَسِلُ وَيَصُومُ. [رواه البخاري: ١٩٢٥-١٩٢٦]

**938.** Aişə və Ummu Sələmə رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ (ailəsi ilə yaxınlıq etdikdən sonra) dan yeri söküləndə cunub ikən yuxudan oyanıb qüsl edər və orucunu tutardı." (əl-Buxari, 1925-1926)

## 17-ci fəsil. Oruc tutan adamın (öz qadınını) qucaqlaması haqqında

## ١٧– باب: الْمُبَاشَرَةُ لِلصَّائِمِ

٩٣٩ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كَانَ النَّبِيُّ ﷺ يُقَبِّلُ وَيُبَاشِرُ، وَهُوَ صَائِمٌ، وَكَانَ أَمْلَكَكُمْ لِإِرْبِهِ. [رواه البخاري: ١٩٢٧]

**939.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ orucluqda (zövcələrini) qucaqlayıb öpərdi. (Təbii ki, nəfsini) saxlamaqda ən möhkəm iradəsi olanınız o idi." (əl-Buxari, 1927)

## 18-ci fəsil. Oruc tutan adamın unudaraq yeməsi və ya içməsi

## ١٨– باب: الصَّائِمُ إِذَا أَكَلَ أَوْ شَرِبَ نَاسِيًا

٩٤٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا نَسِيَ فَأَكَلَ وَشَرِبَ فَلْيُتِمَّ صَوْمَهُ، فَإِنَّمَا أَطْعَمَهُ اللَّهُ وَسَقَاهُ». [رواه البخاري: ١٩٣٣]

**940.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əgər (kimsə) unudub (yemək) yeyərsə və ya (su) içərsə, qoy orucuna davam etsin. Çünki (həmin vaxt) onu yedirdən də, içirdən də Allahdır." (əl-Buxari, 1933)

---

[1] Muhərrəm ayının 10-u.

### 19-cu fəsil. Ramazanda (oruc ikən) cinsi əlaqəyə girmiş kimsənin (kəffarə olaraq) verməyə bir şeyi yoxdursa və onun özünə sədəqə verilmişdirsə, (bunu öz ailəsinə verməklə) kəffarə edə bilər

### ١٩ – باب: إِذَا جَامَعَ فِى رَمَضَانَ وَلَمْ يَكُنْ لَهُ شَىْءٌ فَتُصُدِّقَ عَلَيْهِ فَلْيُكَفِّرْ

٩٤١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: بَيْنَمَا نَحْنُ جُلُوسٌ عِنْدَ النَّبِيِّ ﷺ إِذْ جَاءَهُ رَجُلٌ، فَقَالَ يَا رَسُولَ اللَّه هَلَكْتُ. قَالَ: «مَا لَكَ». قَالَ وَقَعْتُ عَلَى امْرَأَتِى وَأَنَا صَائِمٌ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «هَلْ تَجِدُ رَقَبَةً تُعْتِقُهَا». قَالَ لاَ. قَالَ: «فَهَلْ تَسْتَطِيعُ أَنْ تَصُومَ شَهْرَيْنِ مُتَتَابِعَيْنِ». قَالَ لاَ. فَقَالَ: «فَهَلْ تَجِدُ إِطْعَامَ سِتِّينَ مِسْكِينًا». قَالَ لاَ. قَالَ فَمَكَثَ النَّبِىُّ ﷺ، فَبَيْنَا نَحْنُ عَلَى ذَلِكَ أُتِىَ النَّبِىُّ ﷺ بِعَرَقٍ فِيهَا تَمْرٌ – وَالْعَرَقُ الْمِكْتَلُ – قَالَ: «أَيْنَ السَّائِلُ». فَقَالَ أَنَا. قَالَ: «خُذْهَا فَتَصَدَّقْ بِهِ». فَقَالَ الرَّجُلُ: أَعَلَى أَفْقَرَ مِنِّى يَا رَسُولَ اللَّه فَوَاللَّه مَا بَيْنَ لاَبَتَيْهَا – يُرِيدُ الْحَرَّتَيْنِ – أَهْلُ بَيْتٍ أَفْقَرُ مِنْ أَهْلِ بَيْتِى، فَضَحِكَ النَّبِىُّ ﷺ حَتَّى بَدَتْ أَنْيَابُهُ ثُمَّ قَالَ: «أَطْعِمْهُ أَهْلَكَ». [رواه البخاري: ١٩٣٦]

**941.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "(Bir dəfə) biz Peyğəmbərin ﷺ yanında oturmuşduq. Birdən bir nəfər gəlib dedi: "Ya Rəsulullah, həlak oldum." Peyğəmbər ﷺ soruşdu: "Nə olub sənə?" Dedi: "(Ramazanda) oruclu ikən zövcəmlə cinsi əlaqəyə girmişəm." (Peyğəmbər ﷺ) soruşdu: "Kölə azad edə bilərsənmi?" O: "Xeyr!"– dedi. (Peyğəmbər ﷺ) soruşdu: "İki ay ardıcıl oruc tuta bilərsənmi?" O: "Xeyr!"– dedi. (Peyğəmbər ﷺ) soruşdu: "Altmış kasıbı yedirdə bilərsənmi?" O: "Xeyr!"– dedi.

Bundan sonra Peyğəmbər ﷺ bir qədər susdu. Bu əsnada Peyğəmbərə ﷺ bir zənbil xurma gətirdilər. (Peyğəmbər ﷺ) soruşdu: "Sual verən adam haradadır?" Adam: "Mən (buradayam)"– dedi. (Peyğəmbər ﷺ zənbili ona tərəf uzadıb) buyurdu: "Götür bunu, (öz adından) sədəqə ver!" Adam dedi: "Məndən də kasıb olanamı sədəqə verim, ya Rəsulullah? Vallahi ki, Mədinənin bu iki daş-kəsəkli sahəsi arasında mənim ailəmdən daha kasıb ailə yoxdur." Peyğəmbər ﷺ dişləri görünənədək[1] güldü, sonra dedi: "Elə isə bunu ailənə yedirt!" (əl-Buxari, 1936)

### 20-ci fəsil. Oruc tutan adamın qan aldırması və qusması

### ٢٠ – باب: الْحِجَامَةُ وَالْقَىْءُ لِلصَّائِمِ

٩٤٢ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّ النَّبِىَّ ﷺ احْتَجَمَ، وَهُوَ مُحْرِمٌ وَاحْتَجَمَ وَهُوَ صَائِمٌ. [رواه البخاري: ١٩٣٨]

**942.** İbn Abbas ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ ihramda ikən qan aldırdığı kimi oruclu ikən də qan aldırmışdır." (əl-Buxari, 1938)

### 21-ci fəsil. Səfərdə oruc tutmaq və ya tutmamaq

### ٢١ – باب: الصَّوْمُ فِى السَّفَرِ وَالإِفْطَارُ

٩٤٣ – عَنْ ابْنِ أَبِى أَوْفَى ﷺ قَالَ: كُنَّا مَعَ رَسُولِ اللَّهِ ﷺ فِى سَفَرٍ فَقَالَ لِرَجُلٍ: «انْزِلْ فَاجْدَحْ لِى». قَالَ يَا رَسُولَ اللَّهِ الشَّمْسُ، قَالَ: «انْزِلْ فَاجْدَحْ لِى». قَالَ يَا رَسُولَ اللَّهِ الشَّمْسُ. قَالَ: «انْزِلْ فَاجْدَحْ لِى». فَنَزَلَ، فَجَدَحَ

[1] Peyğəmbər ﷺ gülərkən heç vaxt damağı görünməzdi. O, sadəcə gülümsəyərdi.

لَهُ، فَشَرِبَ، ثُمَّ رَمَى بِيَدِهِ هَا هُنَا، ثُمَّ قَالَ: «إِذَا رَأَيْتُمُ اللَّيْلَ أَقْبَلَ مِنْ هَا هُنَا فَقَدْ أَفْطَرَ الصَّائِمُ». [رواه البخاري: ١٩٤١]

**943.** Rəvayət edilir ki, ibn Əbu Əufə ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə səfərdə olarkən o, bir adama: "Düş, mənim üçün sıyıq hazırla!"– deyə buyurdu. Adam dedi: "Ya Rəsulullah, gün (hələ batmayıb axı)." Peyğəmbər ﷺ (bir də) buyurdu: "Düş, mənim üçün sıyıq hazırla!" Adam (yenə) dedi: "Ya Rəsulullah, gün (hələ batmayıb axı)." Peyğəmbər ﷺ (yenə) buyurdu ki: "Düş, mənim üçün sıyıq hazırla!" Onda həmin adam (miniyindən) enib onun üçün sıyıq hazırladı. (Peyğəmbər ﷺ) sıyıqdan içdikdən sonra əlini (şərqə tərəf) uzadıb dedi: "Gecənin bu istiqamətdən gəldiyini gördüyünüz zaman, (bilin ki,) artıq oruc tutan adam orucunu açmalıdır." (əl-Buxari, 1941)

**٩٤٤ –** عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ حَمْزَةَ بْنَ عَمْرٍو الأَسْلَمِيَّ قَالَ لِلنَّبِيِّ ﷺ أَأَصُومُ فِي السَّفَرِ وَكَانَ كَثِيرَ الصِّيَامِ. فَقَالَ: «إِنْ شِئْتَ فَصُمْ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ». [رواه البخاري: ١٩٤٣]

**944.** Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها rəvayət etmişdir ki, tez-tez oruc tutan Həmzə ibn Amr əl-Əsləmi Peyğəmbərdən ﷺ: "Səfərdə oruc tuta bilərəmmi?"– deyə soruşmuş, o da ona: "İstəyirsən tut, istəyirsən tutma!"– deyə cavab vermişdir. (əl-Buxari, 1943)

## 22-ci fəsil. Ramazanın bir neçə gününü oruc tutduqdan sonra səfərə çıxmaq

## ٢٢– باب: إِذَا صَامَ أَيَّامًا مِنْ رَمَضَانَ ثُمَّ سَافَرَ

**٩٤٥ –** عَنِ ابْنِ عَبَّاسٍ رَضِيَ اللَّهُ عَنْهُمَا، أَنَّ رَسُولَ اللَّهِ ﷺ خَرَجَ إِلَى مَكَّةَ فِي رَمَضَانَ فَصَامَ حَتَّى بَلَغَ الْكَدِيدَ أَفْطَرَ، فَأَفْطَرَ النَّاسُ. [رواه البخاري: ١٩٤٤]

**945.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ ramazan ayında Məkkəyə yola düşdü və (müəyyən müddətədək) oruc tutdu. Nəhayət, Kədidə[1] gəlib çatdıqda orucunu açdı və (onun yanında olan) insanlar da oruclarını açdılar." (əl-Buxari, 1944)

## 23-cü fəsil

## ٢٣– باب

**٩٤٦ –** عَنْ أَبِي الدَّرْدَاءِ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ: خَرَجْنَا مَعَ النَّبِيِّ ﷺ فِي بَعْضِ أَسْفَارِهِ فِي يَوْمٍ حَارٍّ حَتَّى يَضَعَ الرَّجُلُ يَدَهُ عَلَى رَأْسِهِ مِنْ شِدَّةِ الْحَرِّ، وَمَا فِينَا صَائِمٌ إِلاَّ مَا كَانَ مِنَ النَّبِيِّ ﷺ وَابْنِ رَوَاحَةَ. [رواه البخاري: ١٩٤٥]

**946.** Rəvayət edilir ki, Əbu Dərda ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə isti bir gündə səfərə çıxdıq. (Elə bir isti var idi ki,) istinin şiddətindən adam əlini başına tuturdu. Həmin gün aramızda Peyğəmbərdən ﷺ və ibn Rəvahadan başqa heç kəs oruc tutmamışdı." (əl-Buxari, 1945)

---

[1] Məkkənin yaxınlığında Osfanla Kudey arasında yerləşən bir yer.

## 24-cü fəsil. Peyğəmbərin ﷺ: «Səfərdə oruc tutmaq yaxşı əməl deyildir» sözü

## ٢٤- باب: قَوْلُ النَّبِىِّ ﷺ: «لَيْسَ مِنَ الْبِرِّ الصَّوْمُ فِى السَّفَرِ»

٩٤٧ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ فِى سَفَرٍ، فَرَأَى زِحَامًا، وَرَجُلاً قَدْ ظُلِّلَ عَلَيْهِ، فَقَالَ: «مَا هَذَا». فَقَالُوا صَائِمٌ. فَقَالَ: «لَيْسَ مِنَ الْبِرِّ الصَّوْمُ فِى السَّفَرِ». [رواه البخاري: ١٩٤٦]

**947.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ səfərdə ikən taqətdən düşmüş bir kişinin ətrafına toplanmış əshabələri görüb (onlardan): "Nə baş verib?"– deyə soruşdu. Onlar: "Bu adam oruc tutub"– deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: "Səfərdə oruc tutmaq yaxşı əməl deyildir." (əl-Buxari, 1946)

## 25-ci fəsil. Peyğəmbərin ﷺ oruc tutan və tutmayan əshabələri (buna görə) bir-birilərini qınamamışlar

## ٢٥- باب: لَمْ يَعِبْ أَصْحَابُ النَّبِىِّ ﷺ بَعْضُهُمْ بَعْضًا فِى الصَّوْمِ وَالإِفْطَارِ

٩٤٨ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: كُنَّا نُسَافِرُ مَعَ النَّبِىِّ ﷺ فَلَمْ يَعِبِ الصَّائِمُ عَلَى الْمُفْطِرِ، وَلاَ الْمُفْطِرُ عَلَى الصَّائِمِ. [رواه البخاري: ١٩٤٧]

**948.** Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxardıq və (aramızda) oruc tutanlar tutmayanları, tutmayanlar da tutanları qınamazdılar." (əl-Buxari, 1947)

## 26-cı fəsil. Boynunda orucun qəzası[1] qalaraq ölən kimsə

## ٢٦- باب: مَنْ مَاتَ وَعَلَيْهِ صَوْمٌ

٩٤٩ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَنْ مَاتَ وَعَلَيْهِ صِيَامٌ صَامَ عَنْهُ وَلِيُّهُ». [رواه البخاري: ١٩٥٢]

**949.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əgər ölən adamın boynunda qəza orucu qalmışdırsa, qoy onun yaxınlarından biri həmin orucu tutsun." (əl-Buxari, 1952)

٩٥٠ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: جَاءَ رَجُلٌ إِلَى النَّبِىِّ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ إِنَّ أُمِّى مَاتَتْ، وَعَلَيْهَا صَوْمُ شَهْرٍ، أَفَأَقْضِيهِ عَنْهَا قَالَ: «نَعَمْ، فَدَيْنُ اللَّهِ أَحَقُّ أَنْ يُقْضَى». [رواه البخاري: ١٩٥٣]

**950.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, anam vəfat etmiş və boynunda bir ayın orucu qalmışdır. Mən onun yerinə bu orucu tuta bilərəmmi?" Peyğəmbər ﷺ buyurdu: "Bəli, (tuta bilərsən). Borcu ödənməyə ən çox haqqı olan Allahdır." (əl-Buxari, 1953)

[1] Burada ramazandan qalmış qəza orucu, yaxud nəzir edilmiş oruc, yaxud da kəffarə orucu qəsd edilir.

### 27-ci fəsil. Oruc tutan adam nə zaman iftar etməlidir?

### ٢٧- باب: مَتَى يَحِلُّ فِطْرُ الصَّائِمِ

٩٥١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِي أَوْفَى ﷺ قَالَ: سِرْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ وَهُوَ صَائِمٌ، فَلَمَّا غَرَبَتِ الشَّمْسُ قَالَ: «انْزِلْ، فَاجْدَحْ لَنَا». قَالَ يَا رَسُولَ اللَّهِ، لَوْ أَمْسَيْتَ، قَالَ: «انْزِلْ، فَاجْدَحْ لَنَا». قَالَ: يَا رَسُولَ اللَّهِ، إِنَّ عَلَيْكَ نَهَارًا، قَالَ: «انْزِلْ، فَاجْدَحْ لَنَا». فَنَزَلَ، فَجَدَحَ، ثُمَّ قَالَ: «إِذَا رَأَيْتُمُ اللَّيْلَ أَقْبَلَ مِنْ هَا هُنَا فَقَدْ أَفْطَرَ الصَّائِمُ»، وَأَشَارَ بِإِصْبَعِهِ قِبَلَ الْمَشْرِقِ. [رواه البخاري: ١٩٥٦]

**951.** Rəvayət edilir ki, Abdullah ibn Əbu Əufə ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxdıq; o, (səfərdə) oruc tutmuşdu. (Nəhayət,) gün batmağa meyl etdikdə Peyğəmbər ﷺ (bir adama): "Düş, bizim üçün sıyıq hazırla!"– deyə buyurdu. Adam dedi: "Ya Rəsulullah, bəlkə axşama kimi gözləyəsiniz." Peyğəmbər ﷺ (yenə) buyurdu: "Düş, bizim üçün sıyıq hazırla!" Adam dedi: "Ya Rəsulullah, gün (hələ batmayıb axı)." Peyğəmbər ﷺ (bir də) buyurdu: "Düş, bizim üçün sıyıq hazırla!" Onda həmin adam (miniyindən) enib onun üçün sıyıq hazırladı. Daha sonra Peyğəmbər ﷺ: "Gecənin bu istiqamətdən gəldiyini gördüyünüz zaman, artıq oruc tutan adam orucunu açmalıdır"– dedi və əlini məşriqə tərəf uzatdı." (əl-Buxari, 1956)

### 28-ci fəsil. İftar vaxtı girən kimi orucu açmaq

### ٢٨- باب: تَعْجِيلُ الإِفْطَارِ

٩٥٢ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ يَزَالُ النَّاسُ بِخَيْرٍ مَا عَجَّلُوا الْفِطْرَ». [رواه البخاري: ١٩٥٧]

**952.** Səhl ibn Səd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar oruclarını erkən açacaqları müddət ərzində xeyir içində olacaqlar." (əl-Buxari, 1957)

### 29-cu fəsil. Ramazanda yemək yedikdən sonra günəşi görmək

### ٢٩- باب: إِذَا أَفْطَرَ فِي رَمَضَانَ ثُمَّ طَلَعَتِ الشَّمْسُ

٩٥٣ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ﷺ قَالَتْ: أَفْطَرْنَا عَلَى عَهْدِ النَّبِيِّ ﷺ يَوْمَ غَيْمٍ، ثُمَّ طَلَعَتِ الشَّمْسُ. [رواه البخاري: ١٩٥٩]

**953.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr ﷺ demişdir: "Biz Peyğəmbərin ﷺ zamanında göy üzü buludlu olduğu bir gündə (günəşin batdığını güman edib) orucumuzu açdıq, sonra da gün çıxdı." (əl-Buxari, 1959)

### 30-cu fəsil. Uşaqların oruc tutması

### ٣٠- باب: صَوْمُ الصِّبْيَانِ

٩٥٤ – عَنِ الرُّبَيِّعِ بِنْتِ مُعَوِّذٍ ﷺ قَالَتْ: أَرْسَلَ النَّبِيُّ ﷺ غَدَاةَ عَاشُورَاءَ إِلَى قُرَى الأَنْصَارِ «مَنْ أَصْبَحَ مُفْطِرًا فَلْيُتِمَّ بَقِيَّةَ يَوْمِهِ، وَمَنْ أَصْبَحَ صَائِمًا فَلْيَصُمْ». قَالَتْ فَكُنَّا نَصُومُهُ بَعْدُ، وَنُصَوِّمُ صِبْيَانَنَا، وَنَجْعَلُ لَهُمُ اللُّعْبَةَ مِنَ الْعِهْنِ، فَإِذَا بَكَى أَحَدُهُمْ عَلَى الطَّعَامِ أَعْطَيْنَاهُ ذَاكَ، حَتَّى يَكُونَ عِنْدَ الإِفْطَارِ. [رواه البخاري: ١٩٦٠]

**954.** Rəvayət edilir ki, Rubeyyi bint Muəvviz ﷺ demişdir: "Peyğəmbər ﷺ Aşura günü səhər (bir nəfərlə) ənsarın yaşadıqları kəndlərə xəbər göndərdi ki: "Kim səhər yemək yeyibsə, günün qalan hissəsini yemək yeməsin (oruc tutsun); kim də yeməyibsə, orucuna davam etsin."

(Rubeyyi) demişdir: "Sonralar biz (hər il aşura günü) həm özümüz oruc tutar, həm də uşaqlarımıza oruc tutmağı əmr edərdik. Biz onlar üçün yundan oyuncaq düzəldərdik ki, onlardan biri ağlayıb yemək istədikdə bunu ona verək, iftar vaxtına qədər (başı qarışsın)." (əl-Buxari, 1960)

## 31-ci fəsil. Orucu dan yeri sökülənədək tutmaq olar

## ٣١- باب: الْوِصَالُ إِلَى السَحْرِ

**٩٥٥** – عَنْ أَبِي سَعِيدٍ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ: «لاَ تُوَاصِلُوا، فَأَيُّكُمْ إِذَا أَرَادَ أَنْ يُوَاصِلَ فَلْيُوَاصِلْ حَتَّى السَّحَرِ». [رواه البخاري: ١٩٦٣]

**955.** Əbu Səiddən ﷺ rəvayət edilir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "(Orucu pozmadan bir neçə gün) dalbadal[1] oruc tutmayın! Hansı biriniz orucunu pozmadan onun vaxtını uzatmaq istəyirsə, qoy dan yeri sökülənədək orucunu davam etsin." (əl-Buxari, 1963)

## 32-ci fəsil. Orucu pozmadan növbəti orucu tutanların cəzalandırılması

## ٣٢- باب: التَّنْكِيلُ لِمَنْ أَكْثَرَ الْوِصَالَ

**٩٥٦** – (أ)- عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: نَهَى رَسُولُ اللَّهِ ﷺ عَنِ الْوِصَالِ فِي الصَّوْمِ فَقَالَ لَهُ رَجُلٌ مِنَ الْمُسْلِمِينَ إِنَّكَ تُوَاصِلُ يَا رَسُولَ اللَّهِ؟ قَالَ: «وَأَيُّكُمْ مِثْلِي إِنِّي أَبِيتُ يُطْعِمُنِي رَبِّي وَيَسْقِينِ». فَلَمَّا أَبَوْا أَنْ يَنْتَهُوا عَنِ الْوِصَالِ وَاصَلَ بِهِمْ يَوْمًا ثُمَّ يَوْمًا، ثُمَّ رَأَوُا الْهِلاَلَ، فَقَالَ: «لَوْ تَأَخَّرَ لَزِدْتُكُمْ». كَالتَّنْكِيلِ لَهُمْ، حِينَ أَبَوْا أَنْ يَنْتَهُوا.
وَ فِي رِوَايَةٍ عَنْهُ قَالَ ﷺ: «فَاكْلَفُوا مِنَ الْعَمَلِ مَا تُطِيقُونَ». [رواه البخاري: ١٩٦٥]

**956.** (a) – Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbər ﷺ (iftar etmədən) dalbadal oruc tutmağı qadağan etdi. Müsəlmanlardan biri ona dedi: "Axı sən özün dalbadal oruc tutursan, ya Rəsulullah?!" Peyğəmbər ﷺ buyurdu: "Hansınız mənim kimi ola bilər?! Gecələr yeməyi və içməyi mənə Rəbbim verir[2]". (Bəziləri) dalbadal oruc tutacaqlarına israr etdikdə Peyğəmbər ﷺ onlarla birlikdə iki gün dalbadal oruc tutdu, sonra onlar (şəvvalın) hilalını gördülər. Peyğəmbər ﷺ dedi: "Əgər hilal gec görünsəydi, mən sizə əlavə oruc tutmağı vadar edəcəkdim." Belə etmək istəyirdi ki, inadkarlıq etdiklərinə görə onları cəzalandırsın." (əl-Buxari, 1965)

**٩٥٦** – (ب)- وَ فِي رِوَايَةٍ عَنْهُ قَالَ ﷺ: «إِنِّي أَبِيتُ يُطْعِمُنِي رَبِّي وَيَسْقِينِ، فَاكْلَفُوا مِنَ الْعَمَلِ مَا تُطِيقُونَ». [رواه البخاري: ١٩٦٦]

---

[1] Axşam yemək yemədən (iftar açmadan) davamlı bir neçə gün oruc tutmaq.
[2] Mən güc və qüvvəti Rəbbimdən alıram.

**956.** (b) – Digər rəvayətdə Peyğəmbər ﷺ demişdir: “Gecələr yeməyi və içməyi mənə Rəbbim verir. Siz isə gücünüz çatan işləri görün!” (əl-Buxari, 1966)

## 33-cü fəsil. Qardaşına nafilə orucunu pozması üçün and içdirən kimsə

## ٣٣– باب: مَنْ أَقْسَمَ عَلَى أَخِيهِ لِيُفْطِرَ فِى التَّطَوُّعِ

٩٥٧ – عَنْ أَبِى جُحَيْفَةَ ﷺ قَالَ: آخَى النَّبِىُّ ﷺ بَيْنَ سَلْمَانَ وَأَبِى الدَّرْدَاءِ ﷺ، فَزَارَ سَلْمَانُ أَبَا الدَّرْدَاءِ، فَرَأَى أُمَّ الدَّرْدَاءِ مُتَبَذِّلَةً. فَقَالَ لَهَا مَا شَأْنُكِ قَالَتْ أَخُوكَ أَبُو الدَّرْدَاءِ لَيْسَ لَهُ حَاجَةٌ فِى الدُّنْيَا. فَجَاءَ أَبُو الدَّرْدَاءِ، فَصَنَعَ لَهُ طَعَامًا. فَقَالَ كُلْ. قَالَ فَإِنِّى صَائِمٌ. قَالَ مَا أَنَا بِآكِلٍ حَتَّى تَأْكُلَ. قَالَ فَأَكَلَ. فَلَمَّا كَانَ اللَّيْلُ ذَهَبَ أَبُو الدَّرْدَاءِ يَقُومُ. قَالَ نَمْ. فَنَامَ، ثُمَّ ذَهَبَ يَقُومُ. فَقَالَ نَمْ. فَلَمَّا كَانَ مِنْ آخِرِ اللَّيْلِ قَالَ سَلْمَانُ قُمِ الآنَ. فَصَلَّيَا، فَقَالَ لَهُ سَلْمَانُ إِنَّ لِرَبِّكَ عَلَيْكَ حَقًّا، وَلِنَفْسِكَ عَلَيْكَ حَقًّا، وَلأَهْلِكَ عَلَيْكَ حَقًّا، فَأَعْطِ كُلَّ ذِى حَقٍّ حَقَّهُ. فَأَتَى النَّبِىَّ ﷺ فَذَكَرَ ذَلِكَ لَهُ، فَقَالَ النَّبِىُّ ﷺ: «صَدَقَ سَلْمَانُ». [رواه البخاري: ١٩٦٨]

**957.** Rəvayət edilir ki, Əbu Cuheyfə ﷺ demişdir: “Salmanla Əbu Dərda Peyğəmbərin ﷺ sayəsində bir-birilə qardaş oldular. (Bir dəfə) Salman Əbu Dərdanı ziyarət etdi və Ummu Dərdanın[1] əynində köhnə paltar olduğunu görüb: “Niyə bu görkəmdəsən?”– deyə soruşdu. (Ummu Dərda): “Qardaşın Əbu Dərdanın dünyaya marağı yoxdur”– deyə cavab verdi. Sonra Əbu Dərda gəlib Salmanın qabağına yemək qoydu. Salman: “(Sən də) ye!”– dedi. Əbu Dərda: “Mən oruc tutmuşam”– dedi. Salman: “Sən yeməyincə mən yeyən deyiləm”– dedi, o da yeməkdən yedi. Gecə olduqda Əbu Dərda qalxıb namaz qılmaq istədi. Salman: “(Hələlik) yat!”– dedi, o da yatdı. Sonra yenə qalxıb namaz qılmaq istədikdə Salman: “(Hələlik) yat!”– dedi. Nəhayət, gecənin axır saatlarında Salman (ona): “İndi qalxa bilərsən” dedi və onlar (qalxıb) namaz qıldılar. Sonra Salman ona dedi: “Rəbbinin sənin üzərində haqqı vardır, nəfsinin sənin üzərində haqqı vardı, ailənin sənin üzərində haqqı vardır. Elə isə hər bir haqq sahibinə haqqını ver.” (Səhəri gün) Əbu Dərda Peyğəmbərin ﷺ yanına gəlib hadisəni ona xəbər verdikdə, Peyğəmbər ﷺ: “Salman doğru söyləmişdir”– dedi. (əl-Buxari, 1968)

## 34-cü fəsil. Şaban ayının orucu

## ٣٤– باب: صَوْمُ شَعْبَانَ

٩٥٨ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَصُومُ حَتَّى نَقُولَ لاَ يُفْطِرُ، وَيُفْطِرُ حَتَّى نَقُولَ لاَ يَصُومُ. فَمَا رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ اسْتَكْمَلَ صِيَامَ شَهْرٍ إِلاَّ رَمَضَانَ، وَمَا رَأَيْتُهُ أَكْثَرَ صِيَامًا مِنْهُ فِى شَعْبَانَ. [رواه البخاري: ١٩٦٩]

**958.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “(Bəzən) Peyğəmbər ﷺ o qədər oruc tutardı ki, axırda biz: “Orucunu kəsməyəcək”– deyərdik. (Bəzən də) o vaxta qədər oruc tutmazdı ki, nəhayət, biz: “Bir daha oruc tutmayacaq”– deyərdik. Mən Peyğəmbərin ﷺ ramazan istisna olmaqla, heç bir ayı başdan-başa oruc tutduğunu görməmişəm. Həmçinin (başqa aylarda) şaban ayında olduğu qədər çox oruc tutduğunu da görməmişəm.” (əl-Buxari, 1969)

[1] Ummu Dərda ﷺ Əbu Dərdanın ﷺ həyat yoldaşıdır.

٩٥٩ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: لَمْ يَكُنِ النَّبِيُّ ﷺ يَصُومُ شَهْرًا أَكْثَرَ مِنْ شَعْبَانَ، فَإِنَّهُ كَانَ يَصُومُ شَعْبَانَ كُلَّهُ، وَكَانَ يَقُولُ: «خُذُوا مِنَ الْعَمَلِ مَا تُطِيقُونَ، فَإِنَّ اللَّهَ لاَ يَمَلُّ حَتَّى تَمَلُّوا» وَأَحَبُّ الصَّلاَةِ إِلَى النَّبِيِّ ﷺ مَا دُووِمَ عَلَيْهِ، وَإِنْ قَلَّتْ وَكَانَ إِذَا صَلَّى صَلاَةً دَاوَمَ عَلَيْهَا. [رواه البخاري: ١٩٧٠]

**959.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ heç bir ayda şaban ayında tutduğu qədər çox oruc tutmazdı. Elə olurdu ki, o, şaban ayını başdan-başa oruc tuturdu. O, deyərdi: "Gücünüz çatan işləri görün! Siz usanmadıqca Allah usanmaz."

Peyğəmbərin ﷺ ən çox xoşuna gələn namaz, qısa da olsa davamlı qılınanı idi. O, hər hansı bir namazı qılardısa, onu davamlı qılardı." (əl-Buxari, 1970)

## 35-ci fəsil. Peyğəmbərin ﷺ orucu və iftarı barəsində deyilənlər

## ٣٥– باب: مَا يُذْكَرُ مِنْ صَوْمِ النَّبِيِّ ﷺ وَإِفْطَارِهِ

٩٦٠ – عَنْ أَنَسٍ رضي الله عنه، وَ قَدْ سُئِلَ عَنْ صِيَامِ النَّبِيِّ ﷺ فَقَالَ: مَا كُنْتُ أُحِبُّ أَنْ أَرَاهُ مِنَ الشَّهْرِ صَائِمًا إِلاَّ رَأَيْتُهُ وَلاَ مُفْطِرًا إِلاَّ رَأَيْتُهُ، وَلاَ مِنَ اللَّيْلِ قَائِمًا إِلاَّ رَأَيْتُهُ، وَلاَ نَائِمًا إِلاَّ رَأَيْتُهُ، وَلاَ مَسِسْتُ خَزَّةً وَلاَ حَرِيرَةً أَلْيَنَ مِنْ كَفِّ رَسُولِ اللَّهِ ﷺ، وَلاَ شَمِمْتُ مِسْكَةً وَلاَ عَبِيرَةً أَطْيَبَ رَائِحَةً مِنْ رَائِحَةِ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ١٩٧٤]

**960.** Rəvayət edilir ki, Ənəsdən رضي الله عنه Peyğəmbərin ﷺ orucu barəsində soruşdular. O dedi: "Mən istənilən ayda onun oruc tutduğunu görmək istəyirdimsə, görürdüm, oruc tutmadığını görmək istəyirdimsə, onu da görürdüm. Həmçinin, gecələr onun namaz qıldığını görmək istəyirdimsə, görürdüm, yatdığını görmək istəyirdimsə, onu da görürdüm. Mən heç vaxt Peyğəmbərin ﷺ əlindən daha yumşaq bir ipəyə əsla toxunmamışam, Peyğəmbərdən ﷺ gələn qoxudan daha gözəl bir müşk və ya başqa bir ətir qoxusu əsla iyləməmişəm." (əl-Buxari, 1973)

## 36-cı fəsil. Oruca dair bədənin haqqı

## ٣٦– باب: حَقُّ الْجِسْمِ فِي الصَّوْمِ

٩٦١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ الْعَاصِ رضي الله عنهما قَالَ: قَالَ لِي رَسُولُ اللَّهِ ﷺ: «يَا عَبْدَ اللَّهِ أَلَمْ أُخْبَرْ أَنَّكَ تَصُومُ النَّهَارَ وَتَقُومُ اللَّيْلَ». فَقُلْتُ بَلَى يَا رَسُولَ اللَّهِ. قَالَ: «فَلاَ تَفْعَلْ، صُمْ وَأَفْطِرْ، وَقُمْ وَنَمْ، فَإِنَّ لِجَسَدِكَ عَلَيْكَ حَقًّا، وَإِنَّ لِعَيْنِكَ عَلَيْكَ حَقًّا، وَإِنَّ لِزَوْجِكَ عَلَيْكَ حَقًّا، وَإِنَّ لِزَوْرِكَ عَلَيْكَ حَقًّا، وَإِنَّ بِحَسْبِكَ أَنْ تَصُومَ كُلَّ شَهْرٍ ثَلاَثَةَ أَيَّامٍ، فَإِنَّ لَكَ بِكُلِّ حَسَنَةٍ عَشْرَ أَمْثَالِهَا، فَإِنَّ ذَلِكَ صِيَامُ الدَّهْرِ كُلِّهِ». فَشَدَّدْتُ، فَشُدِّدَ عَلَيَّ، قُلْتُ يَا رَسُولَ اللَّهِ، إِنِّي أَجِدُ قُوَّةً. قَالَ:«فَصُمْ صِيَامَ نَبِيِّ اللَّهِ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ وَلاَ تَزِدْ عَلَيْهِ». قُلْتُ وَمَا كَانَ صِيَامُ نَبِيِّ اللَّهِ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ قَالَ:«نِصْفَ الدَّهْرِ». رواه البخاري: ١٩٧٥]

**961.** Rəvayət edilir ki, Abdullah ibn Amr ibn əl-As رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ mənə belə buyurdu: "Ey Abdullah, elə bilirsən ki, sənin (ara vermədən) gündüzlər oruc tutub, gecələr namaz qıldığını mənə xəbər verməyiblər?!" Dedim: "(Bilirəm ki,) xəbərin var, ya Rəsulullah!" O buyurdu: "Belə etmə! Hərdən oruc tut, hərdən də tutma, gecənin bir hissəsini namaz qıl, bir hissəsini də yat! Sözsüz ki, bədəninin sənin üzərində haqqı vardır, gözlərinin sənin üzərində haqqı

vardır, həyat yoldaşının sənin üzərində haqqı vardır, qonağının sənin üzərində haqqı vardır. Şübhəsiz ki, hər ayın üç gününü oruc tutmaq sənə yetər. Belə ki, bir yaxşılığın əvəzi sənə on qat verilər. Bu da tam bir ilin orucuna bərabər olar." Mən daha çox (rüsxət istədim), lakin daha da sərt münasibət gördüm. Mən dedim: "Ya Rəsulullah, mən özümdə (oruc tutmağa) qüvvə hiss edirəm." Peyğəmbər ﷺ buyurdu: "Elə isə Allahın peyğəmbəri Davud əleyhissəlamın tutduğu orucu tut və buna heç nə əlavə etmə!" Mən soruşdum: "Allahın peyğəmbəri Davud əleyhissəlamın tutduğu oruc necə idi ki?" Peyğəmbər ﷺ buyurdu: "İlin yarısını (oruc tutardı)!" (əl-Buxari, 1975)

## 37-ci fəsil. Oruca dair ailənin haqqı

## ٣٧- باب: حَقُّ الأَهْلِ فِى الصَّوْمِ

٩٦٢ – وَ فِي رِوَايَةٍ عَنْهُ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «فَصُمْ صِيَامَ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ، كَانَ يَصُومُ يَوْمًا وَيُفْطِرُ يَوْمًا، وَلاَ يَفِرُّ إِذَا لاَقَى». قَالَ مَنْ لِى بِهَذِهِ يَا نَبِيَّ اللَّهِ. قَالَ النَّبِيُّ ﷺ: «لاَ صَامَ مَنْ صَامَ الأَبَدَ»، مَرَّتَيْنِ. [رواه البخاري: ١٩٧٧]

**962.** Digər bir rəvayətdə deyilir ki, Peyğəmbər ﷺ (ona) belə buyurmuşdur: "Elə isə Davud ﷺ tutduğu orucu tut! O, günaşırı oruc tutardı və düşmənlə qarşılaşdıqda dönüb qaçmazdı."

Abdullah demişdir: "Mən hara, bu cür oruc tutmaq hara, ey Allahın peyğəmbəri!" (Belə olduqda) Peyğəmbər ﷺ iki dəfə buyurmuşdur: "Ömrü boyu oruc tutanın orucu yoxdur.[1]" (əl-Buxari, 1977)

## 38-ci fəsil. Bir camaatı ziyarət edib onların yanında orucunu açmayan kimsə

## ٣٨- باب: مَنْ زَارَ قَوْمًا فَلَمْ يُفْطِرْ عِنْدَهُمْ

٩٦٣ – عَنْ أَنَسٍ ﷺ قَالَ: دَخَلَ النَّبِيُّ ﷺ عَلَى أُمِّ سُلَيْمٍ، فَأَتَتْهُ بِتَمْرٍ وَسَمْنٍ، قَالَ: «أَعِيدُوا سَمْنَكُمْ فِى سِقَائِهِ، وَتَمْرَكُمْ فِى وِعَائِهِ، فَإِنِّى صَائِمٌ». ثُمَّ قَامَ إِلَى نَاحِيَةٍ مِنَ الْبَيْتِ، فَصَلَّى غَيْرَ الْمَكْتُوبَةِ، فَدَعَا لأُمِّ سُلَيْمٍ، وَأَهْلِ بَيْتِهَا، فَقَالَتْ أُمُّ سُلَيْمٍ يَا رَسُولَ اللَّهِ، إِنَّ لِى خُوَيْصَّةً، قَالَ: «مَا هِىَ». قَالَتْ خَادِمُكَ أَنَسٌ. فَمَا تَرَكَ خَيْرَ آخِرَةٍ وَلاَ دُنْيَا إِلاَّ دَعَا لِى بِهِ قَالَ: «اللَّهُمَّ ارْزُقْهُ مَالاً وَوَلَدًا وَبَارِكْ لَهُ». فَإِنِّى لَمِنْ أَكْثَرِ الأَنْصَارِ مَالاً. وَحَدَّثَتْنِى ابْنَتِى أُمَيْنَةُ أَنَّهُ دُفِنَ لِصُلْبِى مَقْدَمَ حَجَّاجٍ الْبَصْرَةَ بِضْعٌ وَعِشْرُونَ وَمِائَةٌ. [رواه البخاري: ١٩٨٢]

**963.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Peyğəmbər ﷺ Ummu Suleymin[2] yanına gəldi və o, Peyğəmbərin ﷺ qabağına xurma və yağ qoydu. Peyğəmbər ﷺ buyurdu: "Yağınızı tuluğa, xurmalarınızı da zənbilə boşaldın, mən oruc tutmuşam." Peyğəmbər ﷺ qalxıb evin bir tərəfində nafilə namazı qıldı və Ummu Suleym və onun ailəsi üçün dua etdi. Onda Ummu Suleym dedi: "Ya Rəsulullah, mənim ayrıca bir xahişim var." Peyğəmbər ﷺ soruşdu: "Nədir o?" Ummu Suleym dedi: "Xidmətçin Ənəs (üçün dua et)!" Peyğəmbər ﷺ dünya və axirətə aid xeyirli nə varsa, hamısını mənim üçün dua etdi və belə dedi: "Allahım, ona mal-dövlət və övlad bəxş et və ona xeyir-bərəkət ver!"

---

[1] Yəni, ara vermədən gündəlik olaraq oruc tutan adamın orucu qəbul olunmaz.

[2] Ummu Suleym ﷺ Ənəsin ﷺ anasıdır.

Həqiqətən də, (bu gün) mən ənsarın ən varlı adamlarındanam. Qızım Umeynə mənə xəbər vermişdir ki, Həccacın Bəsrədə hakimiyyətə gəldiyi dövrədək mənim nəslimdən yüz iyirmidən çox adam dəfn edilmişdir." (əl-Buxari, 1982)

## 39-cu fəsil. Ayın axırında oruc tutmaq

## ٣٩- باب: الصَّوْمُ آخِرَ الشَّهْرِ

٩٦٤ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ رضي الله عنهما، سَأَلَ النَّبِيُّ ﷺ رَجُلاً وَعِمْرَانُ يَسْمَعُ – فَقَالَ: «يَا أَبَا فُلاَنٍ أَمَا صُمْتَ سَرَرَ هَذَا الشَّهْرِ». قَالَ أَظُنُّهُ قَالَ يَعْنِي رَمَضَانَ. قَالَ الرَّجُلُ لاَ يَا رَسُولَ اللَّهِ. قَالَ: «فَإِذَا أَفْطَرْتَ فَصُمْ يَوْمَيْنِ». وَ فِي رِوَايَةٍ قَالَ: «مِنْ سَرَرِ شَعْبَانَ». [رواه البخاري: ١٩٨٣]

**964.** İmran ibn Husayn رضي الله عنهما rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ bir nəfərə belə sual verdiyini eşitmişdir: "Ey Əbu filankəs[1], bu ayın axırında oruc tutmadınmı?!" Deyəsən, o, ramazan ayını qəsd edirdi. O adam: "Xeyr, ya Rəsulullah!"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "(Ramazan) orucunu bitirdikdən sonra iki gün də (əlavə) oruc tut!"

Digər rəvayətdə Peyğəmbər ﷺ: "Şaban ayının axırında oruc tutmadınmı?!"– deyə soruşmuşdur. (əl-Buxari, 1983)

## 40-cı fəsil. Cümə günü oruc tutmaq

## ٤٠- باب: صَوْمُ يَوْمِ الْجُمُعَةِ

٩٦٥ – عَنْ جَابِرٍ رضي الله عنه أَنَّهُ قِيلَ لَهُ: أَ نَهَى النَّبِيُّ ﷺ عَنْ صَوْمِ يَوْمِ الْجُمُعَةِ؟ قَالَ نَعَمْ. [رواه البخاري: ١٩٨٤]

**965.** Rəvayət edilir ki, Cabirdən رضي الله عنه soruşdular: "Peyğəmbər ﷺ cümə günü oruc tutmağı qadağan etmişdirmi?" O: "Bəli!"– deyə cavab verdi. (əl-Buxari, 1984)

٩٦٦ – عَنْ جُوَيْرِيَةَ بِنْتِ الْحَارِثِ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ دَخَلَ عَلَيْهَا يَوْمَ الْجُمُعَةِ وَهِيَ صَائِمَةٌ فَقَالَ: «أَصُمْتِ أَمْسِ». قَالَتْ لاَ. قَالَ: «تُرِيدِينَ أَنْ تَصُومِي غَدًا». قَالَتْ لاَ. قَالَ: «فَأَفْطِرِي». [رواه البخاري: ١٩٨٦]

**966.** Cuveyriyə bint əl-Haris رضي الله عنها rəvayət etmişdir ki, cümə günü o, oruc tutmuş ikən Peyğəmbər ﷺ onun evinə gəlib (ondan): "Dünən oruc tutmusanmı?"– deyə soruşmuş, o da: "Xeyr!"– deyə cavab vermişdir. Peyğəmbər ﷺ (ondan): "Sabah oruc tutmaq istəyirsənmi?"– deyə soruşmuş, o da: "Xeyr!"– deyə cavab vermişdir. Onda Peyğəmbər ﷺ (ona): "Elə isə orucunu aç!"– deyə buyurmuşdur. (əl-Buxari, 1986)

## 41-ci fəsil. Müəyyən günləri oruc tutmaq üçün xüsusiləşdirmək olarmı?

## ٤١- باب: هَلْ يَخُصُّ شَيْئًا مِنَ الأَيَّامِ

٩٦٧ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهَا سُئِلَتْ: هَلْ كَانَ رَسُولُ اللَّهِ ﷺ يَخْتَصُّ مِنَ الأَيَّامِ شَيْئًا؟ قَالَتْ لاَ، كَانَ عَمَلُهُ دِيمَةً، وَأَيُّكُمْ يُطِيقُ مَا كَانَ رَسُولُ اللَّهِ ﷺ يُطِيقُ. [رواه البخاري: ١٩٨٧]

[1] Əbu filankəs – filankəsin atası deməkdir. Buna ərəbcə kunya deyilir. Kunya – ismin əvvəlinə "əbu (ata)", yaxud "ummu (ana)", yaxud "ibn (oğul)", yaxud da "bint (qız)" sözlərindən birini qoşmaqla əmələ gələn ləqəb və ya ayamadır.

**967.** Rəvayət edilir ki, Aişədən ﵂ soruşdular: “Peyğəmbər ﷺ müəyyən günlərdə oruc tutmağı xüsusiləşdirərdimi?” O dedi: “Xeyr! Onun etdiyi əməllər davamiyyətli olardı. Bir də ki, hansı biriniz Peyğəmbərin ﷺ tab gətirdiyi çətinliklərə tab gətirə bilər?!” (əl-Buxari, 1987)

## 42-ci fəsil. Təşriq[1] günlərində oruc tutmaq

## ٤٢– باب: صِيَامُ أَيَّامِ التَّشْرِيقِ

**٩٦٨ –** عَنْ عَائِشَةَ وَ ابْنِ عُمَرَ ﭫ قَالاَ: لَمْ يُرَخَّصْ فِى أَيَّامِ التَّشْرِيقِ أَنْ يُصَمْنَ، إِلاَّ لِمَنْ لَمْ يَجِدِ الْهَدْىَ. [رواه البخاري: ١٩٩٧-١٩٩٨]

**968.** Rəvayət edilir ki, Aişə və ibn Ömər ﭫ demişlər: “Təşriq günlərində heç kəsə oruc tutmağa rüsxət verilməmişdir. Yalnız kəsməyə qurbanlıq heyvanı olmayan kimsələrdən başqa.” (əl-Buxari, 1997-1998)

## 43-cü fəsil. Aşura[2] günü oruc tutmaq

## ٤٣– باب: صَوْمُ يَوْمِ عَاشُورَاءَ

**٩٦٩ –** عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كَانَ يَوْمُ عَاشُورَاءَ تَصُومُهُ قُرَيْشٌ فِى الْجَاهِلِيَّةِ، وَكَانَ رَسُولُ اللَّهِ ﷺ يَصُومُهُ، فَلَمَّا قَدِمَ الْمَدِينَةَ صَامَهُ، وَأَمَرَ بِصِيَامِهِ، فَلَمَّا فُرِضَ رَمَضَانُ تَرَكَ يَوْمَ عَاشُورَاءَ، فَمَنْ شَاءَ صَامَهُ، وَمَنْ شَاءَ تَرَكَهُ. [رواه البخاري: ٢٠٠٢]

**969.** Rəvayət edilir ki, Aişə demişdir: “Cahiliyyət dövründə qureyşlilər aşura günü oruc tutardılar; Peyğəmbər ﷺ də həmin gün oruc tutardı. O, Mədinəyə gəldikdən sonra aşura orucunu həm özü tutdu, həm də bunu əshabələrinə əmr etdi. Ramazan ayını oruc tutmaq vacib buyrulduqdan sonra Aşura gününün orucunu tərk etdi[3]. Bundan sonra Aşura orucunu kim istəsə tutar, kim istəsə, tutmazdı.” (əl-Buxari, 2002)

**٩٧٠ –** عَنْ ابْنِ عَبَّاسٍ ﭭ قَالَ: قَدِمَ النَّبِىُّ ﷺ الْمَدِينَةَ، فَرَأَى الْيَهُودَ تَصُومُ يَوْمَ عَاشُورَاءَ، فَقَالَ: «مَا هَذَا؟» قَالُوا: هَذَا يَوْمٌ صَالِحٌ، هَذَا يَوْمٌ نَجَّى اللَّهُ بَنِى إِسْرَائِيلَ مِنْ عَدُوِّهِمْ، فَصَامَهُ مُوسَى. قَالَ: «فَأَنَا أَحَقُّ بِمُوسَى مِنْكُمْ»، فَصَامَهُ وَأَمَرَ بِصِيَامِهِ. [رواه البخاري: ٢٠٠٤]

**970.** Rəvayət edilir ki, ibn Abbas ﭭ demişdir: “Peyğəmbər ﷺ Mədinəyə gəldikdə yəhudilərin aşura günü oruc tutduqlarını görüb soruşdu ki: “Bu nədir?” Onlar dedilər: “Bu, gözəl bir gündür! Bu, Allahın İsrail oğullarını onların düşmənlərindən xilas etdiyi gündür! (Elə bu səbəbdən də) Musa həmin günü oruc tutmuşdur.” Peyğəmbər ﷺ buyurdu: “Mən Musaya (onun etdiyini davam etməyə) sizdən daha haqlıyam.” Sonra o, həmin günü oruc tutdu və əshabələrinə də oruc tutmağı əmr etdi. (əl-Buxari, 2004)

---

[1] Zülhiccə ayının 11-i, 12-si və 13-ü.

[2] 937-ci hədisin qeydlərinə bax.

[3] Yəni, onun hökmünün vacibliyini ləğv etdi, lakin buna baxmayaraq əshabələr bu orucu Sünnə olaraq qəbul edib tutardılar. Nəinki aşura gününü, hətta onunla bərabər bir gün əvvəl və ya bir gün sonra Sünnə olaraq oruc tutardılar.

# ٣٢ – كِتَابُ صَلاةِ التَّرَاوِيح

# 32 – Təravih[1] namazı kitabı

## ١ – باب: فَضْلُ مَنْ قَامَ رَمَضَانَ

## 1-ci fəsil. Ramazanda gecə namazı qılan kimsənin fəziləti

٩٧١ – عَنْ عَائِشَةَ ﵂، أَنَّ رَسُولَ اللَّهِ ﷺ خَرَجَ لَيْلَةً مِنْ جَوْفِ اللَّيْلِ، فَصَلَّى فِى الْمَسْجِدِ، وَصَلَّى رِجَالٌ بِصَلاَتِهِ، فَأَصْبَحَ النَّاسُ فَتَحَدَّثُوا، فَاجْتَمَعَ أَكْثَرُ مِنْهُمْ، فَصَلَّوْا مَعَهُ، فَأَصْبَحَ النَّاسُ فَتَحَدَّثُوا، فَكَثُرَ أَهْلُ الْمَسْجِدِ مِنَ اللَّيْلَةِ الثَّالِثَةِ، فَخَرَجَ رَسُولُ اللَّهِ ﷺ فَصَلَّى، فَصَلَّوْا بِصَلاَتِهِ، فَلَمَّا كَانَتِ اللَّيْلَةُ الرَّابِعَةُ عَجَزَ الْمَسْجِدُ عَنْ أَهْلِهِ، حَتَّى خَرَجَ لِصَلاَةِ الصُّبْحِ، فَلَمَّا قَضَى الْفَجْرَ أَقْبَلَ عَلَى النَّاسِ، فَتَشَهَّدَ ثُمَّ قَالَ: «أَمَّا بَعْدُ، فَإِنَّهُ لَمْ يَخْفَ عَلَيَّ مَكَانُكُمْ، وَلَكِنِّى خَشِيتُ أَنْ تُفْتَرَضَ عَلَيْكُمْ فَتَعْجِزُوا عَنْهَا». فَتُوُفِّىَ رَسُولُ اللَّهِ ﷺ وَالأَمْرُ عَلَى ذَلِكَ. [رواه البخاري: ٢٠١٢]

**971.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ (ramazan ayında) gecənin bir aləmində məscidə gəlib namaz qıldı və bir neçə əshabə də onunla birlikdə bu namazı qıldı. Səhəri gün camaat bu namazdan (başqalarına) danışmağa başladı. Növbəti gecə namaza əvvəlkindən daha çox adam toplaşıb onun arxasında (gecə) namazı qıldılar. Səhəri gün camaat yenə bu namazdan danışdı. Üçüncü gecə məscidə gələnlərin sayı lap çox idi. Peyğəmbər ﷺ gəlib (gecə) namazını qıldı və əshabələr də onunla birlikdə bu namazı qıldılar. Dördüncü gecə (namaza gələnlərin sayı həddindən artıq çox olduğundan) camaat məscidə yerləşmirdi. (O gecə Peyğəmbər ﷺ namaza gəlmədi.). Nəhayət, səhər məscidə gəlib sübh namazını qıldırdı, sonra da üzünü camaata tutub şəhadət kəlməsini gətirdi və dedi: "Sonra isə... Doğrusu, mən sizin etdiklərinizdən xəbərsiz deyildim. Lakin mən bu namazın sizə vacib buyrulacağından və sizin də onu yerinə yetirə bilməyəcəyinizdən ehtiyat etdim."

Peyğəmbər ﷺ vəfat etdikdən sonra da vəziyyət olduğu kimi qalmışdı.[2] (əl-Buxari, 2012)

---

[1] Ramazan ayı başlayandan ta qurtaranadək gündəlik olaraq işa namazından sonra istər məsciddə, istərsə də başqa bir təmiz yerdə, fərdi olaraq və ya camaatla birlikdə on bir rükət qılınan gecə namazı.

[2] Yəni, Peyğəmbər ﷺ vəfat edənədək əshabələr təravih namazlarını camaat şəklində qılmadılar. Əbu Bəkrin ﵁ xilafəti dövründə də həmçinin, vəziyyət olduğu kimi qalırdı. Nəhayət Ömər ibn Xəttabın ﵁ xəlifə olduğu dövrdə əshabələrin yekdil fikri ilə bu namazlar məsciddə, camaat şəklində qılınmağa başladı və indiyədək qılınmaqdadır.

# ٣٣ – كِتَابُ فَضْلِ لَيْلَةِ الْقَدْرِ

# 33 – Qədr gecəsinin fəziləti kitabı

## ١ – باب: الْتِمَاسُ لَيْلَةِ الْقَدْرِ فِى السَّبْعِ الأَوَاخِرِ

## 1-ci fəsil. Qədr gecəsini ramazanın axır yeddi gecəsində axtarmaq gərəkdir

٩٧٢ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما، أَنَّ رِجَالاً مِنْ أَصْحَابِ النَّبِىِّ ﷺ أُرُوا لَيْلَةَ الْقَدْرِ فِى الْمَنَامِ فِى السَّبْعِ الأَوَاخِرِ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَرَى رُؤْيَاكُمْ قَدْ تَوَاطَأَتْ فِى السَّبْعِ الأَوَاخِرِ، فَمَنْ كَانَ مُتَحَرِّيهَا فَلْيَتَحَرَّهَا فِى السَّبْعِ الأَوَاخِرِ». [رواه البخاري: ٢٠١٥]

**972.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ əshabələrindən bir neçəsi yuxuda Qədr gecəsinin (ramazan ayının) axır yeddi gecəsindən birində olacağını gördülər. Onda Peyğəmbər ﷺ buyurdu: "Görürəm, (qədr gecəsinin) son yeddi gecədə olacağına dair gördüyünüz yuxular bir-birinə uyğun gəlir. Odur ki, qoy bu gecəni axtaranlar son yeddi gecədə axtarsınlar." (əl-Buxari, 2015)

٩٧٣ – عَنْ أَبِي سَعِيد رضي الله عنه قَالَ: اعْتَكَفْنَا مَعَ النَّبِىِّ ﷺ الْعَشْرَ الأَوْسَطَ مِنْ رَمَضَانَ، فَخَرَجَ صَبِيحَةَ عِشْرِينَ، فَخَطَبَنَا وَقَالَ: «إِنِّى أُرِيتُ لَيْلَةَ الْقَدْرِ، ثُمَّ أُنْسِيتُهَا أَوْ نُسِّيتُهَا، فَالْتَمِسُوهَا فِى الْعَشْرِ الأَوَاخِرِ فِى الْوَتْرِ، وَإِنِّى رَأَيْتُ أَنِّى أَسْجُدُ فِى مَاءٍ وَطِينٍ، فَمَنْ كَانَ اعْتَكَفَ مَعَ رَسُولِ اللَّهِ فَلْيَرْجِعْ». فَرَجَعْنَا وَمَا نَرَى فِى السَّمَاءِ قَزَعَةً، فَجَاءَتْ سَحَابَةٌ فَمَطَرَتْ حَتَّى سَالَ سَقْفُ الْمَسْجِدِ وَكَانَ مِنْ جَرِيدِ النَّخْلِ، وَأُقِيمَتِ الصَّلاَةُ، فَرَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَسْجُدُ فِى الْمَاءِ وَالطِّينِ، حَتَّى رَأَيْتُ أَثَرَ الطِّينِ فِى جَبْهَتِهِ ﷺ. [رواه البخاري: ٢٠١٦]

**973.** Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə ramazan ayının orta on gününü (məsciddə etikaf[1] etdik). İyirminci günün səhəri o, (minbərə) qalxıb xütbə verdi və dedi: "Qədr gecəsinin nə zaman olacağı mənə göstərildi, sonra isə bu mənə unutduruldu[2]. Siz onu son on günün tək gecələrində axtarın. Mən yuxuda su və palçıq üzərinə səcdə etdiyimi gördüm. Kim Allahın Elçisi ilə etikaf etmişdirsə, (etikafını davam etməyə) qayıtsın." Beləliklə, biz etikafımızı davam etdik. (Həmin gecə) göydə bir dənə də olsun bulud yox idi. Birdən başımızın üstünü buludlar aldı və elə (gur) yağış yağdı ki, hətta məscidin xurma budaqlarından düzəldilmiş tavanı belə dammağa başladı. Sonra namaz üçün iqamə verildi. Mən Peyğəmbərin ﷺ su və palçıq üzərinə səcdə etdiyini, hətta alnındakı palçığın izini də gördüm. (əl-Buxari, 2016)

[1] 205-ci hədisin qeydlərinə bax.
[2] 46-cı hədisə bax.

## 2-ci fəsil. Qədr gecəsini ramazanın son on gecəsinin tək gecələrində axtarmaq

## ٢- باب: تَحَرِّى لَيْلَةِ الْقَدْرِ فِى الْوِتْرِ مِنَ الْعَشْرِ الأَوَاخِرِ

٩٧٤ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄: أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «الْتَمِسُوهَا فِى الْعَشْرِ الأَوَاخِرِ مِنْ رَمَضَانَ لَيْلَةَ الْقَدْرِ فِى تَاسِعَةٍ تَبْقَى، فِى سَابِعَةٍ تَبْقَى، فِى خَامِسَةٍ تَبْقَى». [رواه البخاري: ٢٠٢١]

**974.** İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qədr gecəsini ramazanın son on gecəsinin tək gecələrində – ayın axırına doqquz, yaxud yeddi, yaxud da beş (gecə) qalmış axtarın.” (əl-Buxari, 2021)

٩٧٥ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «هِيَ فِى الْعَشْرِ، هِيَ فِى تِسْعٍ يَمْضِينَ أَوْ فِى سَبْعٍ يَبْقَيْنَ». يَعْنِى لَيْلَةَ الْقَدْرِ. [رواه البخاري: ٢٠٢٢]

**975.** İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qədr gecəsi (son) on (gecədən birində) olacaq və (bu gecə) ya əvvəlki doqquz gecədən (birinə), ya da (axır) yeddi gecədən (birinə) təsadüf edəcəkdir.” (əl-Buxari, 2022)

## 3-cü fəsil. Ramazanın axır on günündə yerinə yetirilən əməllər

## ٣- باب: الْعَمَلُ فِى الْعَشْرِ الأَوَاخِرِ مِنْ رَمَضَانَ

٩٧٦ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كَانَ النَّبِيُّ ﷺ إِذَا دَخَلَ الْعَشْرُ شَدَّ مِئْزَرَهُ، وَأَحْيَا لَيْلَهُ، وَأَيْقَظَ أَهْلَهُ. [رواه البخاري: ٢٠٢٤]

**976.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “(Ramazanın) axır on günü yetişdikdə Peyğəmbər ﷺ belbağını bərk-bərk bağlayardı[1] və gecələri həm özü ibadət edər, həm də ailəsini yuxudan oyadardı (ki, onlar da ibadət etsinlər).” (əl-Buxari, 2024)

[1] Yəni, ramazanın axır on günündə canla-başla ibadət etməyə ciddi hazırlıq görərdi.

# ٣٤ – كِتَابُ الاعْتِكَافِ

# 34 – Etikaf[1] kitabı

## ١– باب: الاعْتِكَافِ فِى الْعَشْرِ الأَوَاخِرِ وَالاِعْتِكَافِ فِى الْمَسَاجِدِ كُلِّهَا

## 1-ci fəsil. Son on gündə etikaf etmək; Bütün məscidlərdə etikaf etmək (olar)

٩٧٧ – عَنْ عَائِشَةَ رضي الله عنها زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَعْتَكِفُ الْعَشْرَ الأَوَاخِرَ مِنْ رَمَضَانَ حَتَّى تَوَفَّاهُ اللَّهُ، ثُمَّ اعْتَكَفَ أَزْوَاجُهُ مِنْ بَعْدِهِ. [رواه البخاري: ٢٠٢٦]

**977.** Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها rəvayət etmişdir ki, Peyğəmbər ﷺ vəfat edənədək (hər) ramazan ayının son on gününü etikafda keçirərdi. Onun vəfatından sonra onun zövcələri etikaf etməyə davam etdilər." (əl-Buxari, 2026)

## ٢– باب: لاَ يَدْخُلُ الْبَيْتَ إِلاَّ لِحَاجَةٍ

## 2-ci fəsil. (Etikafda olan adam) ancaq zəruri halda evinə gedə bilər[2]

٩٧٨ – عَنْ عَائِشَةَ رضي الله عنها زَوْجِ النَّبِيِّ ﷺ قَالَتْ: وَإِنْ كَانَ رَسُولُ اللَّهِ ﷺ لَيُدْخِلُ عَلَيَّ رَأْسَهُ وَهُوَ فِى الْمَسْجِدِ فَأُرَجِّلُهُ، وَكَانَ لاَ يَدْخُلُ الْبَيْتَ إِلاَّ لِحَاجَةٍ، إِذَا كَانَ مُعْتَكِفًا. [رواه البخاري: ٢٠٢٩]

**978.** Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ məsciddə (etikaf edərkən) başını mənim (hücrəmə) daxil edər və mən onun saçlarını darayardım. O, etikaf edərkən zəruri bir ehtiyacı olmadığı təqdirdə, əsla evə gəlməzdi." (əl-Buxari, 2029)

## ٣– باب: الاعْتِكَافُ لَيْلاً

## 3-cü fəsil. Gecə etikaf etmək

٩٧٩ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ عُمَرَ سَأَلَ النَّبِيَّ ﷺ قَالَ كُنْتُ نَذَرْتُ فِى الْجَاهِلِيَّةِ أَنْ أَعْتَكِفَ لَيْلَةً فِى الْمَسْجِدِ الْحَرَامِ، قَالَ: «فَأَوْفِ بِنَذْرِكَ». [رواه البخاري: ٢٠٣٢]

**979.** İbn Ömər رضي الله عنهما rəvayət etmişdir ki, (bir dəfə) Ömər رضي الله عنه (özündə narahatçılıq doğuran bir məsələ barəsində) Peyğəmbərdən ﷺ soruşub dedi: "Mən cahiliyyət dövründə bir gecə Məscidülharamda etikaf edəcəyimə nəzir etmişəm." Peyğəmbər ﷺ (ona): "Elə isə nəzirini yerinə yetir!"– deyə buyurdu. (əl-Buxari, 2032)

## ٤– باب: الأَخْبِيَةُ فِى الْمَسْجِدِ

## 4-cü fəsil. Məsciddə çadır qurmaq

٩٨٠ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ أَرَادَ أَنْ يَعْتَكِفَ، فَلَمَّا انْصَرَفَ إِلَى الْمَكَانِ الَّذِى أَرَادَ أَنْ يَعْتَكِفَ إِذَا أَخْبِيَةٌ خِبَاءُ عَائِشَةَ، وَخِبَاءُ حَفْصَةَ، وَخِبَاءُ زَيْنَبَ، فَقَالَ: «آلْبِرَّ تَقُولُونَ بِهِنَّ». ثُمَّ انْصَرَفَ، فَلَمْ يَعْتَكِفْ، حَتَّى اعْتَكَفَ عَشْرًا مِنْ شَوَّالٍ. [رواه البخاري: ٢٠٣٤]

---

[1] 205-ci hədisin qeydlərinə bax.
[2] Başqa cür desək, məsciddən çıxa bilər.

**980.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ etikaf etmək qərarına gəldi və etikaf etmək istədiyi yerə gəldikdə orada bir neçə çadırın – Aişənin, Həfsənin və Zeynəbin çadırlarının olduğunu görüb (əshabələrinə) dedi: "Bunun yaxşı əməl olduğunumu hesab edirsiniz?" Bundan sonra o çıxıb getdi və etikaf etmədi. Nəhayət, şəvval ayında on gün etikaf etdi. (əl-Buxari, 2034)

## 5-ci fəsil. Etikaf edən adam ehtiyac üzündən məscidin qapısının ağzına çıxa bilərmi?

## ٥– باب: هَلْ يَخْرُجُ الْمُعْتَكِفُ لِحَوَائِجِهِ إِلَى بَابِ الْمَسْجِدِ

٩٨١ – عَنْ صَفِيَّةَ ﵂ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّهَا جَاءَتْ رَسُولَ اللَّهِ ﷺ تَزُورُهُ فِي اعْتِكَافِهِ فِي الْمَسْجِدِ، فِي الْعَشْرِ الأَوَاخِرِ مِنْ رَمَضَانَ، فَتَحَدَّثَتْ عِنْدَهُ سَاعَةً، ثُمَّ قَامَتْ تَنْقَلِبُ، فَقَامَ النَّبِيُّ ﷺ مَعَهَا يَقْلِبُهَا، حَتَّى إِذَا بَلَغَتْ بَابَ الْمَسْجِدِ عِنْدَ بَابِ أُمِّ سَلَمَةَ مَرَّ رَجُلاَنِ مِنَ الأَنْصَارِ، فَسَلَّمَا عَلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ لَهُمَا النَّبِيُّ ﷺ : «عَلَى رِسْلِكُمَا إِنَّمَا هِيَ صَفِيَّةُ بِنْتُ حُيَيٍّ». فَقَالاَ: سُبْحَانَ اللَّهِ يَا رَسُولَ اللَّهِ. وَكَبُرَ عَلَيْهِمَا. فَقَالَ النَّبِيُّ ﷺ: «إِنَّ الشَّيْطَانَ يَبْلُغُ مِنَ الإِنْسَانِ مَبْلَغَ الدَّمِ، وَإِنِّي خَشِيتُ أَنْ يَقْذِفَ فِي قُلُوبِكُمَا شَيْئًا». [رواه البخاري: ٢٠٣٥]

**981.** Peyğəmbərin ﷺ zövcəsi Səfiyyə ﵂ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ ramazanın axır on günündə məsciddə etikaf edərkən ona baş çəkdi, onunla bir müddət söhbət etdikdən sonra çıxıb getmək istədikdə Peyğəmbər ﷺ ayağa qalxıb onu qapıyadək ötürdü. Nəhayət, məscidin qapısına – Ummu Sələmənin qapısının yanına çatdıqda ənsardan olan iki nəfər gəlib onların yanından keçdi və ona salam verdi. Peyğəmbər ﷺ onlara: "Dayanın[1], bu, Səfiyyə bint Huyeydir!"– dedi. Onlar: "Subhanəllah, ya Rəsulullah![2]"– dedilər və bu söz onlara ağır gəldi. Onda Peyğəmbər ﷺ dedi: "Həqiqətən də, şeytan insanın bədənində qan dövran etdiyi kimi dövran edir. Mən onun sizin qəlbinizə (pis) bir şey salacağından ehtiyat etdim." (əl-Buxari, 2035)

## 6-cı fəsil. Ramazanın orta on günündə etikaf etmək

## ٦– باب: الاِعْتِكَافُ فِي الْعَشْرِ الأَوْسَطِ مِنْ رَمَضَانَ

٩٨٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ كَانَ النَّبِيُّ ﷺ يَعْتَكِفُ فِي كُلِّ رَمَضَانَ عَشْرَةَ أَيَّامٍ، فَلَمَّا كَانَ الْعَامُ الَّذِي قُبِضَ فِيهِ اعْتَكَفَ عِشْرِينَ يَوْمًا. [رواه البخاري: ٢٠٤٤]

**982.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ hər ramazanda on gün etikaf edərdi. Vəfat etdiyi ildə isə iyirmi gün etikaf etdi." (əl-Buxari, 2044)

---

[1] Bununla o, əshabələrinə pis zənn etməmələrini tövsiyə etmişdir.
[2] Onlar bu ifadə ilə pis zənnə qapılmadıqlarını bildirdilər.

# ٣٥ – كِتَابُ الْبُيُوعِ

# 35 – Alış-veriş kitabı

## ١ – باب:

## مَا جَاءَ فِي قَوْلِ اللَّهِ تَعَالَى: ﴿فَإِذَا قُضِيَتِ ٱلصَّلَوٰةُ فَٱنتَشِرُوا۟ فِى ٱلْأَرْضِ وَٱبْتَغُوا۟ مِن فَضْلِ ٱللَّهِ وَٱذْكُرُوا۟ ٱللَّهَ كَثِيرًا لَّعَلَّكُمْ تُفْلِحُونَ وَإِذَا رَأَوْا۟ تِجَٰرَةً أَوْ لَهْوًا ٱنفَضُّوٓا۟ إِلَيْهَا وَتَرَكُوكَ قَآئِمًا ۚ قُلْ مَا عِندَ ٱللَّهِ خَيْرٌ مِّنَ ٱللَّهْوِ وَمِنَ ٱلتِّجَٰرَةِ ۚ وَٱللَّهُ خَيْرُ ٱلرَّٰزِقِينَ﴾

## 1-ci fəsil.
## Uca Allahın: "Namaz başa çatdıqdan sonra yer üzünə dağılıb Allahın lütfünü axtarın və Allahı çox zikr edin ki, bəlkə nicat tapasınız. Onlar ticarət və ya əyləncə gördükləri zaman dağılışıb ona tərəf qaçdılar və səni *minbərdə* ayaq üstə olduğun halda tərk etdilər. De: "Allah yanında qazanacağınız savab əyləncədən də, ticarətdən də xeyirlidir. Allah ən yaxşı ruzi verəndir"[1] ayəsi barədə deyilənlər

٩٨٣ – عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ﷺ قَالَ: لَمَّا قَدِمْنَا الْمَدِينَةَ آخَى رَسُولُ اللَّهِ ﷺ بَيْنِي وَبَيْنَ سَعْدِ بْنِ الرَّبِيعِ فَقَالَ: سَعْدُ بْنُ الرَّبِيعِ إِنِّي أَكْثَرُ الأَنْصَارِ مَالاً، فَأَقْسِمُ لَكَ نِصْفَ مَالِي، وَانْظُرْ أَيَّ زَوْجَتَيَّ هَوِيتَ نَزَلْتُ لَكَ عَنْهَا، فَإِذَا حَلَّتْ تَزَوَّجْتَهَا. قَالَ فَقَالَ عَبْدُ الرَّحْمَنِ لاَ حَاجَةَ لِي فِي ذَلِكَ، هَلْ مِنْ سُوقٍ فِيهِ تِجَارَةٌ قَالَ سُوقُ قَيْنُقَاعَ. قَالَ فَغَدَا إِلَيْهِ عَبْدُ الرَّحْمَنِ، فَأَتَى بِأَقِطٍ وَسَمْنٍ – قَالَ – ثُمَّ تَابَعَ الْغُدُوَّ، فَمَا لَبِثَ أَنْ جَاءَ عَبْدُ الرَّحْمَنِ عَلَيْهِ أَثَرُ صُفْرَةٍ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «تَزَوَّجْتَ». قَالَ: نَعَمْ. قَالَ: «وَمَنْ». قَالَ امْرَأَةً مِنَ الأَنْصَارِ. قَالَ: «كَمْ سُقْتَ». قَالَ زِنَةَ نَوَاةٍ مِنْ ذَهَبٍ أَوْ نَوَاةً مِنْ ذَهَبٍ. فَقَالَ لَهُ النَّبِيُّ ﷺ: «أَوْلِمْ وَلَوْ بِشَاةٍ». [رواه البخاري: ٢٠٤٨]

**983.** Rəvayət edilir ki, Abdur-Rəhman ibn Auf ﷺ demişdir: "Biz Mədinəyə gəldikdə Peyğəmbər ﷺ mənimlə Səd ibn Rəbini (bir-birimizə) qardaş etdi. Səd ibn Rəbi dedi: "Mən ənsarın ən varlı adamlarındanam, malımın yarısını sənə verirəm; habelə bax gör zövcələrimdən hansı sənin xoşuna gəlirsə, onu sənin üçün boşayım, iddəsi[2] bitdikdən sonra sən onunla evlən." Abdur-Rəhman dedi: "Mənim buna ehtiyacım yoxdur. Bu (şəhərdə) alver etməyə bazar varmı?" Səd ibn Rəbi: "Qaynuqa[3] bazarı (var)"– dedi."

Səhəri gün Abdur-Rəhman bazara getdi. Axşam (evə qayıtdıqda) qurut və yağ gətirdi. Bundan sonra o, gündəlik olaraq bazara getməyə başladı. Çox keçmədən o, paltarında sarı bir ləkə[4] (Peyğəmbərin ﷺ) yanına gəldi. Peyğəmbər ﷺ (ondan) soruşdu: "Yoxsa evlənmisən?" O: "Bəli!"– dedi. Peyğəmbər ﷺ soruşdu:

---

[1] "əl-Cumuə" surəsi, 10-11.

[2] Ərindən boşanan və ya əri ölən qadının təkrar ərə gedə bilməsi üçün şəriətə görə gözləməli olduğu vaxt. Ərindən boşanan qadın üç dəfə heyz görüncəyədək və ya üç heyzdən təmizlənincəyədək, əri ölən qadın isə dörd ay on gün gözləməlidir.

[3] Bəni Qaynuqa Mədinədə yaşayan yəhudi qəbilələrindən biridir.

[4] Bu, evlənənlərin vurduğu ətirin ləkəsi idi.

“Kiminlə?” O: “Ənsardan olan bir qadınla”– dedi. Peyğəmbər ﷺ soruşdu: “Nə qədər mehr verdin?” O: “Bir çəyirdək ağırlığında qızıl (vermişəm)”– dedi. Onda Peyğəmbər ﷺ ona belə buyurdu: “Elə isə, bir qoyunla da olsa, ziyafət ver!” (əl-Buxari, 2048)

## 2-ci fəsil. Halal da bəllidir, haram da bəllidir. Bu ikisinin arasında şübhəli şeylər vardır

## ٢– باب: الْحَلاَلُ بَيِّنٌ وَالْحَرَامُ بَيِّنٌ وَبَيْنَهُمَا مُشَبَّهَاتٌ

٩٨٤ – عَنْ النُّعْمَانِ بْنِ بَشِيرٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «الْحَلاَلُ بَيِّنٌ، وَالْحَرَامُ بَيِّنٌ وَبَيْنَهُمَا أُمُورٌ مُشْتَبِهَةٌ، فَمَنْ تَرَكَ مَا شُبِّهَ عَلَيْهِ مِنَ الإِثْمِ كَانَ لِمَا اسْتَبَانَ أَتْرَكَ، وَمَنِ اجْتَرَأَ عَلَى مَا يَشُكُّ فِيهِ مِنَ الإِثْمِ أَوْشَكَ أَنْ يُوَاقِعَ مَا اسْتَبَانَ، وَالْمَعَاصِي حِمَى اللَّهِ، مَنْ يَرْتَعْ حَوْلَ الْحِمَى يُوشِكْ أَنْ يُوَاقِعَهُ». [رواه البخاري: ٢٠٥١]

**984.** Nomən ibn Bəşir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Halal da bəllidir, haram da bəllidir; və bu ikisinin arasında şübhəli şeylər vardır. Kim günah olub olmadığına şübhələndiyi bir şeyi tərk etsə, (günah olduğu) bəlli olan bir şeyi daha qətiyyətlə tərk edər. Kim də günah olub-olmadığına şübhələndiyi bir şeyə cürət edib yaxınlaşsa, (günah olduğu) bəlli olan bir şeyə dalmağa yaxın olar. (Biləsiniz,) günahlar Allahın qoruğudur. Hər kim (qoyunlarını) qoruğun ətrafında otarsa, az qalar ki, qoruğa düşsün.” (əl-Buxari, 2051)

## 3-cü fəsil. Şübhəli şeylərin açıqlanması

## ٣– باب: تَفْسِيرُ الْمُشَبَّهَاتِ

٩٨٥ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: كَانَ عُتْبَةُ بْنُ أَبِي وَقَّاصٍ عَهِدَ إِلَى أَخِيهِ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ أَنَّ ابْنَ وَلِيدَةِ زَمْعَةَ مِنِّي فَاقْبِضْهُ. قَالَتْ فَلَمَّا كَانَ عَامَ الْفَتْحِ أَخَذَهُ سَعْدُ بْنُ أَبِي وَقَّاصٍ وَقَالَ ابْنُ أَخِي، قَدْ عَهِدَ إِلَيَّ فِيهِ. فَقَامَ عَبْدُ بْنُ زَمْعَةَ، فَقَالَ أَخِي، وَابْنُ وَلِيدَةِ أَبِي، وُلِدَ عَلَى فِرَاشِهِ. فَتَسَاوَقَا إِلَى النَّبِيِّ ﷺ. فَقَالَ سَعْدٌ: يَا رَسُولَ اللَّهِ، ابْنُ أَخِي، كَانَ قَدْ عَهِدَ إِلَيَّ فِيهِ. فَقَالَ عَبْدُ بْنُ زَمْعَةَ أَخِي وَابْنُ وَلِيدَةِ أَبِي، وُلِدَ عَلَى فِرَاشِهِ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «هُوَ لَكَ يَا عَبْدُ بْنَ زَمْعَةَ». ثُمَّ قَالَ النَّبِيُّ ﷺ: «الْوَلَدُ لِلْفِرَاشِ، وَلِلْعَاهِرِ الْحَجَرُ». ثُمَّ قَالَ لِسَوْدَةَ بِنْتِ زَمْعَةَ زَوْجِ النَّبِيِّ ﷺ: «احْتَجِبِي مِنْهُ». لِمَا رَأَى مِنْ شَبَهِهِ بِعُتْبَةَ، فَمَا رَآهَا حَتَّى لَقِيَ اللَّهَ. [رواه البخاري: ٢٠٥٣]

**985.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Utbə ibn Əbu Vəqqas qardaşı Səd ibn Əbu Vəqqasa: “Zəm'anın kənizinin oğlu məndəndir, onu öz himayənə al”– deyə vəsiyyət etmişdi.

Məkkə fəth edildiyi il Səd ibn Əbu Vəqqas onu yanına alıb dedi: “Bu, mənim qardaşım oğludur! Qardaşım mənə ona qayğı göstərməyi vəsiyyət etmişdir”. Bu vaxt Abd ibn Zəm'a ayağa qalxıb dedi: “O mənim qardaşımdır və atamın cariyəsinin[1] oğludur. Anası onu atamın yatağında dünyaya gətirmişdir”. Bundan sonra hər ikisi Peyğəmbərə ﷺ müraciət etdi. Səd dedi: “Ya Rəsulullah, (bu) mənim qardaşım oğludur. (Qardaşım) mənə ona qayğı göstərməyi vəsiyyət etmişdir.” (Sonra) Abd ibn Zəm'a dedi: “O mənim qardaşımdır və atamın cariyəsinin oğludur. Anası onu atamın yatağında dünyaya gətirmişdir.” Onda

[1] 434-cü hədisin qeydlərinə bax.

Peyğəmbər ﷺ buyurdu: "O sənindir, ey Abd ibn Zəm'a!" Sonra da bunu əlavə etdi: "Uşaq kimin yatağında dünyaya gəlirsə, ona məxsusdur. Zinakar uşaqdan məhrum olmalıdır."

Peyğəmbər ﷺ o cavan oğlanın Utbəyə oxşadığını görəndə öz zövcəsi Səudə bint Zəm'aya: "Onun yanında hicabına bürün!"– deyə buyurdu.[1] Beləliklə də, o oğlan ölənədək Səudəni görmədi. (əl-Buxari, 2053)

## ٤ – باب: مَنْ لَمْ يَرَ الْوَسَاوِسَ وَنَحْوَهَا مِنَ الْمُشَبَّهَاتِ

## 4-cü fəsil. Vəsvəsəni və buna bənzər olanı şübhəli şeylərdən saymayan kimsə haqqında

٩٨٦ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ قَوْمًا قَالُوا يَا رَسُولَ اللَّهِ، إِنَّ قَوْمًا يَأْتُونَنَا بِاللَّحْمِ لاَ نَدْرِى أَذَكَرُوا اسْمَ اللَّهِ عَلَيْهِ أَمْ لاَ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «سَمُّوا اللَّهَ عَلَيْهِ وَكُلُوهُ». [رواه البخاري: ٢٠٥٧]

**986.** Aişə رضي الله عنها rəvayət etmişdir ki, (bir dəfə) bir dəstə adam (Peyğəmbərin ﷺ yanına gəlib) dedi: "Ey Allahın elçisi! Bəzi adamlar bizə ət gətirir və biz bilmirik onlar (heyvanı kəsdikdə) Allahın adını[2] çəkmişlər, ya yox." Peyğəmbər ﷺ buyurdu: "Bismillah" deyib yeyin!" (əl-Buxari, 2057)

## ٥ – باب: مَنْ لَمْ يُبَالِ مِنْ حَيْثُ كَسَبَ الْمَالَ

## 5-ci fəsil. Malını hansı yolla qazandığının fərqinə varmayan kimsə haqqında

٩٨٧ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِىِّ ﷺ قَالَ: «يَأْتِى عَلَى النَّاسِ زَمَانٌ، لاَ يُبَالِى الْمَرْءُ مَا أَخَذَ مِنْهُ أَمِنَ الْحَلاَلِ أَمْ مِنَ الْحَرَامِ». [رواه البخاري: ٢٠٥٩]

**987.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanların yaşadığı elə bir zaman gəlib çatacaq ki, (o vaxt) adam aldığının halal, yoxsa haram olduğunun fərqinə varmayacaq." (əl-Buxari, 2059)

## ٦ – باب: التِّجَارَةُ فِى الْبَزِّ وَ نَحْوِهِ

## 6-cı fəsil. Bez parça və başqa bu kimi şeylərin ticarəti ilə məşğul olmaq

٩٨٨ – عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ وَ زَيْدِ بْنِ أَرْقَمَ رضي الله عنهما قَالاَ: كُنَّا تَاجِرَيْنِ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ فَسَأَلْنَا رَسُولَ اللَّهِ ﷺ عَنِ الصَّرْفِ فَقَالَ: «إِنْ كَانَ يَدًا بِيَدٍ فَلاَ بَأْسَ، وَإِنْ كَانَ نَسَاءً فَلاَ يَصْلُحُ». [رواه البخاري: ٢٠٦٠-٢٠٦١]

---

[1] Zəm'a Peyğəmbərin ﷺ zövcəsi Səudənin رضي الله عنها atası idi. Əvvəl hamı elə bilirdi ki, o cavan oğlan Səudənin رضي الله عنها ögey qardaşıdır. Lakin sonra aydın oldu ki, oğlan ona yad, yəni naməhrəm imiş. Elə bu səbəbdən də Peyğəmbər ﷺ zövcəsinə onun yanında hicab geyməyi əmr etdi.

[2] İslam şəriətinə görə, yeyilməsinə icazə verilmiş pak heyvanı kəsdikdə üzü qibləyə tutub "Bismilləh" demək vacibdir. Əks təqdirdə, yəni "bismilləh" deyilmədən və ya Allahın adını deyil, başqa birisinin adını çəkərək kəsilmiş heyvanın ətini yemək müsəlmana haramdır. Yalnız Kitab əhlinin öz əqidəsinə uyğun olaraq kəsdiyi heyvanlar istisnadır. Bax: "əl-Maidə" surəsi, 5.

**988.** Rəvayət edilir ki, Bəra ibn Azib və Zeyd ibn Ərqam ﵄ demişlər: "Peyğəmbərin ﷺ zamanında biz ticarətlə məşğul olurduq. (Bir dəfə) biz ondan (qızılla gümüşün) mübadiləsi barəsində soruşduq." O buyurdu: "Əgər (qızıl və gümüş) əlbəəl (alınırsa və ya satılırsa), eybi yox. Yox əgər nisyədirsə, olmaz." (əl-Buxari, 2060-2061)

## 7-ci fəsil. Ticarət etmək üçün (səfərə) çıxmaq

## ٧– باب: الْخُرُوجُ فِى التِّجَارَةِ

٩٨٩ – عَنْ عُبَيْد الله بْنِ عُمَيْرٍ أَنَّ أَبَا مُوسَى الأَشْعَرِىَّ ﵁ اسْتَأْذَنَ عَلَى عُمَرَ بْنِ الْخَطَّاب ﵁ فَلَمْ يُؤْذَنْ لَهُ، وَكَأَنَّهُ كَانَ مَشْغُولاً فَرَجَعَ أَبُو مُوسَى، فَفَرَغَ عُمَرُ فَقَالَ أَلَمْ أَسْمَعْ صَوْتَ عَبْد اللَّه بْنِ قَيْسٍ ائْذَنُوا لَهُ قِيلَ قَدْ رَجَعَ، فَدَعَاهُ. فَقَالَ: كُنَّا نُؤْمَرُ بِذَلِكَ. فَقَالَ: تَأْتِينِى عَلَى ذَلِكَ بِالْبَيِّنَة. فَانْطَلَقَ إِلَى مَجْلِسِ الأَنْصَار، فَسَأَلَهُمْ. فَقَالُوا: لاَ يَشْهَدُ لَكَ عَلَى هَذَا إِلاَّ أَصْغَرُنَا أَبُو سَعِيد الْخُدْرِىُّ. فَذَهَبَ بِأَبِى سَعِيد الْخُدْرِىِّ. فَقَالَ عُمَرُ أَخَفِىَ عَلَىَّ مِنْ أَمْرِ رَسُولِ اللَّهِ ﷺ أَلْهَانِى الصَّفْقُ بِالأَسْوَاقِ. يَعْنِى الْخُرُوجَ إِلَى تِجَارَةٍ. [رواه البخاري: ٢٠٦٢]

**989.** Ubeydullah ibn Umeyr rəvayət edir ki, (bir dəfə) Əbu Musa əl-Əşari Ömər ibn Xəttabın qapısını döydü, lakin ona (içəri daxil olmaq üçün) izn verilmədi. Deyəsən, Ömər məşğul idi. Odur ki, Əbu Musa qayıdıb getdi. Ömər işini qurtardıqdan sonra dedi: "Mən Abdullah ibn Qeysin səsini eşitdim, deyilmi? Ona izn verin gəlsin!" (Ömərə): "O çıxıb gedib"– dedilər. Ömər onu çağırtdırdı (və ondan qayıdıb getməyinin səbəbini soruşdu). Əbu Musa dedi: "Bizə belə əmr edilərdi"[1]. Ömər dedi: "Bu dediyini əsaslandırmaq üçün dəlil gətirməlisən." Əbu Musa ənsarın məclisinə gəlib (bu haqda) onlardan soruşdu. Onlar dedilər: "Buna bizim ən kiçiyimiz Əbu Səid əl-Xudri şahidlik edər." O, Əbu Səidlə birgə Ömərin yanına gəldi. Ömər dedi: "Peyğəmbərin ﷺ buyurduqlarında məndən gizli qalanımı var? Bazarlardakı alış-veriş məni bu işdən yayındırmışdır." (əl-Buxari, 2062)

## 8-ci fəsil. Ruzisinin artmasını istəyən kimsə haqqında

## ٨– باب: مَنْ أَحَبَّ الْبَسْطَ فِى الرِّزْقِ

٩٩٠ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﵁ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «مَنْ سَرَّهُ أَنْ يُبْسَطَ لَهُ رِزْقُهُ أَوْ يُنْسَأَ لَهُ فِى أَثَرِهِ فَلْيَصِلْ رَحِمَهُ». [رواه البخاري: ٢٠٦٧]

**990.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qoy ruzisinin artmasını və ömrünün uzanmasını istəyən kəs, qohumları ilə əlaqə saxlasın." (əl-Buxari, 2067)

[1] Yəni, izn istəyən adam üç dəfə izin istəməli, izn verilməsə, dönüb getməlidir.

## 9-cu fəsil. Peyğəmbərin ﷺ nisyə alver etməsi

## ٩- باب: شِرَاءُ النَّبِيِّ ﷺ بِالنَّسِيئَةِ

٩٩١ – عَنْ أَنَسٍ رضي الله عنه أَنَّهُ مَشَى إِلَى النَّبِيِّ ﷺ بِخُبْزِ شَعِيرٍ، وَإِهَالَةٍ سَنِخَةٍ، وَلَقَدْ رَهَنَ النَّبِيُّ ﷺ دِرْعًا لَهُ بِالْمَدِينَةِ عِنْدَ يَهُودِيٍّ، وَأَخَذَ مِنْهُ شَعِيرًا لأَهْلِهِ، وَلَقَدْ سَمِعْتُهُ يَقُولُ: «مَا أَمْسَى عِنْدَ آلِ مُحَمَّدٍ صَاعُ بُرٍّ وَلاَ صَاعُ حَبٍّ، وَإِنَّ عِنْدَهُ لَتِسْعَ نِسْوَةٍ». [رواه البخاري: ٢٠٦٩]

**991.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه Peyğəmbərə ﷺ arpa çörəyi və qaxsımış[1] yağ gətirdi. Peyğəmbər ﷺ Mədinədə ikən öz zirehini bir yəhudinin yanında girov qoymuş və bunun əvəzinə ondan ailəsi üçün arpa çörəyi götürmüşdü.

(Ənəs demişdir): "Mən (Peyğəmbərin ﷺ) belə dediyini eşitdim: "Peyğəmbər ailəsində nə bir saa[2] buğda, nə də bir saa taxıl qalmışdır. Fəqət, onun doqquz zövcəsi vardı." (əl-Buxari, 2069)

## 10-cu fəsil. İnsanın çalışaraq öz əlləri ilə (ruzi) qazanması

## ١٠- باب: كَسْبُ الرَّجُلِ وَعَمَلُهُ بِيَدِهِ

٩٩٢ – عَنْ الْمِقْدَامِ رضي الله عنه عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: «مَا أَكَلَ أَحَدٌ طَعَامًا قَطُّ خَيْرًا مِنْ أَنْ يَأْكُلَ مِنْ عَمَلِ يَدِهِ، وَإِنَّ نَبِيَّ اللَّهِ دَاوُدَ عليه السلام كَانَ يَأْكُلُ مِنْ عَمَلِ يَدِهِ». [رواه البخاري: ٢٠٧٢]

**992.** Miqdam رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İndiyədək heç kəs öz əlləri ilə qazanıb yediyindən daha xeyirli bir yemək yeməmişdir. Allahın peyğəmbəri Davud əleyhissəlam da öz əlləri ilə qazandığından yeyərdi." (əl-Buxari, 2072)

## 11-ci fəsil. Alış-veriş etdikdə üzüyola və alicənab olmaq

## ١١- باب: السُّهُولَةُ وَالسَّمَاحَةُ فِي الشِّرَاءِ وَالْبَيْعِ

٩٩٣ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «رَحِمَ اللَّهُ رَجُلاً سَمْحًا إِذَا بَاعَ، وَإِذَا اشْتَرَى، وَإِذَا اقْتَضَى». [رواه البخاري: ٢٠٧٦]

**993.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Satanda, alanda və haqqını tələb edəndə üzüyola olan kimsəyə Allah mərhəmət etsin!" (əl-Buxari, 2076)

## 12-ci fəsil. (Borcunu qaytarmağa) imkanı olan adama möhlət vermək

## ١٢- باب: مَنْ أَنْظَرَ مُوسِرًا

٩٩٤ – عَنْ حُذَيْفَةَ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «تَلَقَّتِ الْمَلاَئِكَةُ رُوحَ رَجُلٍ مِمَّنْ كَانَ قَبْلَكُمْ قَالُوا أَعَمِلْتَ مِنَ الْخَيْرِ شَيْئًا؟ قَالَ: كُنْتُ آمُرُ فِتْيَانِي أَنْ يُنْظِرُوا وَيَتَجَاوَزُوا عَنِ الْمُوسِرِ فَتَجَاوَزُوا عَنْهُ». [رواه البخاري: ٢٠٧٧]

[1] Köhnəlib qoxumuş və tamı acılaşmış.
[2] 152-ci hədisin qeydlərinə bax.

**994.** Huzeyfə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mələklər sizdən əvvəl yaşamış insanlardan birinin canını aldıqda (ondan) soruşdular: “Heç xeyirxah bir iş görmüsənmi?” O dedi: “Mən həmişə öz xidmətçilərimə (borcunu qaytarmağa) imkanı olan adama belə möhlət verməyi və ona güzəştə getməyi əmr edərdim.” Allah da onu bağışladı. (əl-Buxari, 2077)

## 13-cü fəsil. Alıcı və satıcı (bir-birinə) aydınlıq gətirsə, (bir-birindən) heç nə gizlətməsə və (bir-birinə) məsləhət versə, (onların ticarəti bərəkətli olar)

## ١٣– باب: إِذَا بَيَّنَ الْبَيِّعَانِ وَلَمْ يَكْتُمَا وَنَصَحَا

**٩٩٥** – عَنْ حَكِيمِ بْنِ حِزَامٍ ؓ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «الْبَيِّعَانِ بِالْخِيَارِ مَا لَمْ يَتَفَرَّقَا – أَوْ قَالَ حَتَّى يَتَفَرَّقَا – فَإِنْ صَدَقَا وَبَيَّنَا بُورِكَ لَهُمَا فِي بَيْعِهِمَا، وَإِنْ كَتَمَا وَكَذَبَا مُحِقَتْ بَرَكَةُ بَيْعِهِمَا». [رواه البخاري: ٢٠٧٩]

**995.** Həkim ibn Hizam ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Alıcı və satıcı bir-birindən ayrılanadək ixtiyar sahibidirlər.[1] Əgər onlar düz danışar və aydınlıq gətirərlərsə[2], alış-verişləri bərəkətli olar. Əgər (nəyi isə) gizlədər və yalan danışarlarsa, alış-verişlərinin bərəkəti gedər.” (əl-Buxari, 2079)

## 14-cü fəsil. Qarışdırılmış xurmaların satışı

## ١٤– باب: بَيْعُ الْخِلْطِ مِنَ التَّمْرِ

**٩٩٦** – عَنْ أَبِي سَعِيدٍ ؓ قَالَ: كُنَّا نُرْزَقُ تَمْرَ الْجَمْعِ، وَهُوَ الْخِلْطُ مِنَ التَّمْرِ، وَكُنَّا نَبِيعُ صَاعَيْنِ بِصَاعٍ فَقَالَ النَّبِيُّ ﷺ: «لاَ صَاعَيْنِ بِصَاعٍ، وَلاَ دِرْهَمَيْنِ بِدِرْهَمٍ». [رواه البخاري: ٢٠٨٠]

**996.** Rəvayət edilir ki, Əbu Səid ؓ demişdir: “Bizə qarışıq xurma verilərdi. Biz də bundan iki saa verib əvəzində bir saa (daha keyfiyyətli) xurma satın alardıq. Belə olduqda Peyğəmbər ﷺ buyurdu: “İki saa verib əvəzində bir saa almaq, iki dirhəm verib əvəzində bir dirhəm almaq olmaz.” (əl-Buxari, 2080)

## 15-ci fəsil. Sələm yedirdən adam. Uca Allah buyurur: “Ey iman gətirənlər! Allahdan qorxun və əgər möminsinizsə, sələmdən qalan faizi almayın.”[3]

## ١٥– باب: مُوكِلُ الرِّبَا. لِقَوْلِهِ تَعَالَى: ﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱتَّقُواْ ٱللَّهَ وَذَرُواْ مَا بَقِيَ مِنَ ٱلرِّبَوٰٓاْ إِن كُنتُم مُّؤْمِنِينَ﴾

**٩٩٧** – عَنْ عَوْنِ بْنِ أَبِي جُحَيْفَةَ قَالَ رَأَيْتُ أَبِي اشْتَرَى عَبْدًا حَجَّامًا، فَسَأَلْتُهُ فَقَالَ نَهَى النَّبِيُّ ﷺ عَنْ ثَمَنِ الْكَلْبِ، وَثَمَنِ الدَّمِ، وَنَهَى عَنِ الْوَاشِمَةِ وَالْمَوْشُومَةِ، وَآكِلِ الرِّبَا، وَمُوكِلِهِ، وَلَعَنَ الْمُصَوِّرَ. [رواه البخاري: ٢٠٨٦]

---

[1] Yəni ayrılanadək alıcı aldığını, satıcı da satdığını geri qaytara bilər.

[2] Başqa sözlə, satıcı malın keyfiyyətini və nöqsanını, alıcı da öz şərtini və iradlarını bildirərsə.

[3] “əl-Bəqərə” surəsi, 278.

**997.** Rəvayət edilir ki, Aun ibn Əbu Cuheyfə ﵁ demişdir: "Mən atamın qan almaqla məşğul olan bir köləni aldığını (və onun həcəmətlərinin[1] sındırılmasını əmr etdiyini) gördüm. Bunun səbəbini soruşduqda, atam dedi: "Peyğəmbər ﷺ itin və qanın[2] müqabilində pul almağı, habelə döyməyi və döydürməyi[3], sələm yeməyi və yedirtməyi[4] qadağan etmiş və rəsm[5] çəkəni lənətləmişdir[6]". (əl-Buxari, 2086)

## 16-cı fəsil. "Allah sələmi puç edir, sədəqələri isə artırır. Allah kafirləri və günahkarları sevməz."[7]

## ١٦– باب: ﴿ يَمْحَقُ ٱللَّهُ ٱلرِّبَوٰاْ وَيُرْبِي ٱلصَّدَقَٰتِ ۗ وَٱللَّهُ لَا يُحِبُّ كُلَّ كَفَّارٍ أَثِيمٍ ﴾

٩٩٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «الْحَلِفُ مُنَفِّقَةٌ لِلسِّلْعَةِ مُمْحِقَةٌ لِلْبَرَكَةِ». [رواه البخاري: ٢٠٨٧]

**998.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "(Yalandan) and içmək malın satılmasına rəvac versə də, onun bərəkətini aparır." (əl-Buxari, 2087)

## 17-ci fəsil. Dəmirçi haqqında deyilənlər

## ١٧– باب: ذِكْرُ الْقَيْنِ وَالْحَدَّادِ

٩٩٩ – عَنْ خَبَّابٍ ﵁ قَالَ: كُنْتُ قَيْنًا فِي الْجَاهِلِيَّةِ، وَكَانَ لِي عَلَى الْعَاصِ بْنِ وَائِلٍ دَيْنٌ، فَأَتَيْتُهُ أَتَقَاضَاهُ قَالَ لاَ أُعْطِيكَ حَتَّى تَكْفُرَ بِمُحَمَّدٍ. فَقُلْتُ لاَ أَكْفُرُ حَتَّى يُمِيتَكَ اللَّهُ، ثُمَّ تُبْعَثَ. قَالَ دَعْنِي حَتَّى أَمُوتَ وَأُبْعَثَ، فَسَأُوتَى مَالاً وَوَلَدًا فَأَقْضِيكَ فَنَزَلَتْ: ﴿أَفَرَءَيْتَ ٱلَّذِى كَفَرَ بِـَٔايَٰتِنَا وَقَالَ لَأُوتَيَنَّ مَالًا وَوَلَدًا ﴿٧٧﴾ أَطَّلَعَ ٱلْغَيْبَ أَمِ ٱتَّخَذَ عِندَ ٱلرَّحْمَٰنِ عَهْدًا ﴿٧٨﴾﴾. [رواه البخاري: ٢٠٩١]

**999.** Rəvayət edilir ki, Xəbbab ﵁ demişdir: "Mən cahiliyyət dövründə dəmirçi idim. As ibn Vailin[8] mənə verəcəyi var idi. Mən gəlib borcumu ondan tələb etdikdə o dedi: "Muhəmmədi inkar etməyincə sənə (heç nə) verməyəcəyəm." Mən dedim: "Allah səni öldürüb dirildənədək Muhəmmədi ﷺ inkar etməyəcəyəm." As dedi: "Elə isə mən ölüb dirilənədək gözlə. (Mən diriləndən sonra) mənə var-dövlət və övlad bəxş ediləcək. Onda sənin borcunu qaytararam." (Bu hadisədən

---

[1] Müalicə məqsədilə baş, kürək və bədənin başqa nahiyələrindən qan almaq, qanı sormaq üçün işlədilən buynuzşəkilli alət.

[2] Burada söhbət it satmaqdan və ya müalicə məqsədilə bədəndən qan almaqdan gedir.

[3] Burada döymək deyildikdə, dəridə iynə ilə yazı yazmaq və ya şəkil çəkmək (tatuaj) nəzərdə tutulur. İslamaqədərki dövrdə əsasən qadınlar hansı qəbiləyə mənsub olduqlarını bildirmək üçün bədənlərinin bəzi yerlərinə yazı və ya şəkil döydürərdilər.

[4] Burada faiz alan və verən nəzərdə tutulur.

[5] 1043-cü hədisə bax.

[6] Digər rəvayətdə Əbu Cuheyfə ﵁ demişdir: "Peyğəmbər ﷺ itin, qanın və (zinaya sövq edilmiş) kənizin müqabilində pul almağı qadağan etmiş, üstəlik döyəni və döydürəni, sələm yeyəni və yedirdəni və rəsm çəkəni lənətləmişdir." əl-Buxari, 2087.

[7] "əl-Bəqərə" surəsi, 276.

[8] As ibn Vail əshabə Amrın ﵁ atasıdır. O, müşrik olmuş və ölənədək İslam dinini qəbul etməmişdir.

sonra bu) ayə nazil oldu: "Ayələrimizi inkar edib: "Mənə hökmən var-dövlət və övlad veriləcəkdir!"– deyən adamı gördünmü? Olmaya, o, qeybdən xəbərdardır, yoxsa Mərhəmətli *Allahdan* vədə almışdır?"[1] (əl-Buxari, 2091)

## 18-ci fəsil. Dərzi haqqında deyilənlər

## ١٨– باب: ذِكْرُ الْخَيَّاطِ

١٠٠٠ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: إِنَّ خَيَّاطًا دَعَا رَسُولَ اللَّهِ ﷺ لِطَعَامٍ صَنَعَهُ، قَالَ أَنَسُ بْنُ مَالِكٍ: فَذَهَبْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ إِلَى ذَلِكَ الطَّعَامِ، فَقَرَّبَ إِلَى رَسُولِ اللَّهِ ﷺ خُبْزًا وَمَرَقًا فِيهِ دُبَّاءٌ وَقَدِيدٌ، فَرَأَيْتُ النَّبِيَّ ﷺ يَتَتَبَّعُ الدُّبَّاءَ مِنْ حَوَالَيِ الْقَصْعَةِ – قَالَ – فَلَمْ أَزَلْ أُحِبُّ الدُّبَّاءَ مِنْ يَوْمِئِذٍ. [رواه البخاري: ٢٠٩٢]

**1000.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Bir dərzi yemək hazırlayıb Peyğəmbəri ﷺ qonaq çağırdı. Mən də Peyğəmbərlə ﷺ birlikdə bu qonaqlığa getdim. Adam Peyğəmbərin ﷺ qabağına çörək və içində balqabaq və qurudulmuş ət tikələri olan şorba qoydu. Mən Peyğəmbərin ﷺ qabdakı balqabaq tikələrini seçib yediyini gördüm. O gündən bəri mən də balqabağı xoşlayıram." (əl-Buxari, 2092)

## 19-cu fəsil. Minik heyvanlarının və (o cümlədən də) uzunqulağın satın alınması

## ١٩– باب: شِرَاءُ الدَّوَابِّ وَالْحَمِيرِ

١٠٠١ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ كُنْتُ مَعَ النَّبِيِّ ﷺ فِي غَزَاةٍ، فَأَبْطَأَ بِي جَمَلِي وَأَعْيَا، فَأَتَى عَلَيَّ النَّبِيُّ ﷺ فَقَالَ: «جَابِرٌ». فَقُلْتُ نَعَمْ. قَالَ: «مَا شَأْنُكَ». قُلْتُ أَبْطَأَ عَلَيَّ جَمَلِي وَأَعْيَا، فَتَخَلَّفْتُ. فَنَزَلَ يَحْجُنُهُ بِمِحْجَنِهِ، ثُمَّ قَالَ: «ارْكَبْ». فَرَكِبْتُ، فَلَقَدْ رَأَيْتُهُ أَكُفُّهُ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: «تَزَوَّجْتَ». قُلْتُ نَعَمْ. قَالَ: «بِكْرًا أَمْ ثَيِّبًا». قُلْتُ بَلْ ثَيِّبًا. قَالَ: «أَفَلاَ جَارِيَةً تُلاَعِبُهَا وَتُلاَعِبُكَ». قُلْتُ إِنَّ لِي أَخَوَاتٍ، فَأَحْبَبْتُ أَنْ أَتَزَوَّجَ امْرَأَةً تَجْمَعُهُنَّ، وَتَمْشُطُهُنَّ، وَتَقُومُ عَلَيْهِنَّ. قَالَ: «أَمَّا إِنَّكَ قَادِمٌ، فَإِذَا قَدِمْتَ فَالْكَيْسَ الْكَيْسَ». ثُمَّ قَالَ: «أَتَبِيعُ جَمَلَكَ». قُلْتُ نَعَمْ. فَاشْتَرَاهُ مِنِّي بِأُوقِيَّةٍ، ثُمَّ قَدِمَ رَسُولُ اللَّهِ ﷺ قَبْلِي، وَقَدِمْتُ بِالْغَدَاةِ، فَجِئْنَا إِلَى الْمَسْجِدِ، فَوَجَدْتُهُ عَلَى بَابِ الْمَسْجِدِ، قَالَ: «الآنَ قَدِمْتَ». قُلْتُ نَعَمْ. قَالَ: «فَدَعْ جَمَلَكَ، فَادْخُلْ فَصَلِّ رَكْعَتَيْنِ». فَدَخَلْتُ فَصَلَّيْتُ، فَأَمَرَ بِلاَلاً أَنْ يَزِنَ لِي أُوقِيَّةً. فَوَزَنَ لِي بِلاَلٌ، فَأَرْجَحَ فِي الْمِيزَانِ، فَانْطَلَقْتُ حَتَّى وَلَّيْتُ فَقَالَ: «ادْعُ لِي جَابِرًا». قُلْتُ الآنَ يَرُدُّ عَلَيَّ الْجَمَلَ، وَلَمْ يَكُنْ شَيْءٌ أَبْغَضَ إِلَيَّ مِنْهُ، قَالَ: «خُذْ جَمَلَكَ وَلَكَ ثَمَنُهُ». [رواه البخاري: ٢٠٩٧]

**1001.** Rəvayət edilir ki, Cabir ibn Abdullah demişdir: "Mən Peyğəmbərlə ﷺ birlikdə döyüşlərin birində iştirak edirdim. Bu əsnada mənim dəvəm yorğun düşüb asta-asta getməyə başladı. Onda Peyğəmbər ﷺ mənə yaxınlaşıb: "Cabir!"– deyə çağırdı. Mən: "Bəli!"– dedim. Peyğəmbər ﷺ: "Sənə nə olub?"– deyə soruşdu. Dedim: "Dəvəm yorulub asta-asta gedir, buna görə də mən geri qalmışam." Peyğəmbər ﷺ dəvəsindən yerə enib əlindəki ağacla

[1] "Məryəm" surəsi, 77-78.

(mənim) dəvəmi vurdu, sonra da mənə: “Min!”– dedi. Mən də mindim. (Dəvə sürətlə yerindən götürüldü və) mən Peyğəmbəri ﷺ keçməyim deyə dəvəni tutub saxlamağa başladım. Peyğəmbər ﷺ (məndən) soruşdu: “Evlənmisənmi?” Dedim: “Bəli!” (Yenə) soruşdu: “Bakirə qızla, ya dul qadınla?” Dedim: “Dul qadınla.” Dedi: “Niyə qızla evlənmirsən ki, bir-birinizi əzizləyəsiniz?” Dedim: “(İş orasındadır ki,) mənim körpə bacılarım var. Bu səbəbdən də mən bacılarımı bir yerə yığa biləcək, saçlarını darayacaq və onların qayğısına qalacaq bir qadınla evlənməyi məsləhət bildim. Peyğəmbər ﷺ buyurdu: “İndi sən Mədinəyə qayıdırsan. Elə ki evə gəldin, (zövcəni) o ki var əzizlə!” Sonra soruşdu ki: “Dəvəni satırsanmı?” Mən: “Bəli!”– dedim. Onda Peyğəmbər ﷺ bir övqiyə[1] verib dəvəni məndən satın aldı. Peyğəmbər ﷺ məndən qabaq gəlib (Mədinəyə) çatdı. Mən (ora) səhər çatdım. Biz məscidə getdik və mən məscidin qapısının önündə Peyğəmbəri ﷺ gördüm. O soruşdu: “İndi gəlib çatırsan?” Mən: “Bəli!”– dedim. Peyğəmbər ﷺ (mənə): “Dəvəni burada saxla, (məscidə) gir, iki rükət namaz qıl!”– deyə buyurdu. Mən (məscidə) girib iki rükət namaz qıldım. Sonra Peyğəmbər ﷺ Bilala mənim üçün (tərəzidə) övqiyə çəkməyi əmr etdi, Bilal da onu mənim üçün çəkdi, (hətta) bir az da artıq qoydu. Mən dönüb getdikdə Peyğəmbər ﷺ: “Cabiri yanıma çağırın!”– deyə buyurdu. (Öz-özümə) dedim: “İndi dəvəni mənə geri qaytaracaq.” Bu isə mənim ən xoşlamadığım bir şey idi. (Lakin Peyğəmbər ﷺ) dedi: “Dəvəni götür, pulunu da özünə saxla.” (əl-Buxari, 2097)

## 20-ci fəsil. Susuzluğu yatmayan və ya qotur dəvənin satın alınması

## ٢٠– باب: شِرَاءُ الإِبِلِ الْهِيمِ أَوِ الأَجْرَبِ

١٠٠٢ – عَنْ عَمْرٍو، كَانَ هَا هُنَا رَجُلٌ اسْمُهُ نَوَّاسٌ، وَكَانَتْ عِنْدَهُ إِبِلٌ هِيمٌ، فَذَهَبَ ابْنُ عُمَرَ رضي الله عنهما فَاشْتَرَى تِلْكَ الإِبِلَ مِنْ شَرِيكٍ لَهُ، فَجَاءَ إِلَيْهِ شَرِيكُهُ فَقَالَ بِعْنَا تِلْكَ الإِبِلَ. فَقَالَ مِمَّنْ بِعْتَهَا قَالَ مِنْ شَيْخٍ، كَذَا وَكَذَا. فَقَالَ وَيْحَكَ ذَاكَ – وَاللَّهِ – ابْنُ عُمَرَ. فَجَاءَهُ فَقَالَ إِنَّ شَرِيكِي بَاعَكَ إِبِلاً هِيمًا، وَلَمْ يَعْرِفْكَ. قَالَ فَاسْتَقْهَا. قَالَ فَلَمَّا ذَهَبَ يَسْتَاقُهَا فَقَالَ دَعْهَا، رَضِينَا بِقَضَاءِ رَسُولِ اللَّهِ ﷺ لاَ عَدْوَى. [رواه البخاري: ٢٠٩٩]

**1002.** Rəvayət edilir ki, Amr (ibn Dinar) demişdir: “Burada (Məkkə şəhərində) Nəvvas adlı bir adam var idi. Onun susuzluğu yatmayan xəstə dəvələri var idi. İbn Ömər رضي الله عنهما gedib bu dəvələri onun şərikindən satın aldı. Həmin şərik Nəvvasın yanına gəlib: “O dəvələri satdıq”– dedi. Nəvvas: “Onları kimə satmısan?”– deyə soruşdu. Adam: “Filan qocaya”– deyə cavab verdi. Nəvvas (ona): “Vay sənin halına, vallahi ki, bu ibn Ömərdir”- dedi, sonra da ibn Ömərin yanına gəlib: “Şərikim səni tanımadığından sənə xəstə dəvələr satıb”- deyə (ona dil-ağız etdi). İbn Ömər dedi: “Sür apar onları!” Nəvvas dəvələri sürüb aparmaq istədikdə ibn Ömər dedi: “Qoy qalsın! Biz Allahın Elçisinin ﷺ: “Xəstəlik (öz-özünə) yoluxmur” deyə verdiyi hökmə razıyıq.” (əl-Buxari, 2099)

[1] 708-ci hədisin qeydlərinə bax.

## 21-ci fəsil. Qan alan adam haqqında deyilənlər

## ٢١- باب: ذِكْرُ الْحَجَّامِ

١٠٠٣ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ حَجَمَ أَبُو طَيْبَةَ رَسُولَ اللَّهِ ﷺ فَأَمَرَ لَهُ بِصَاعٍ مِنْ تَمْرٍ، وَأَمَرَ أَهْلَهُ أَنْ يُخَفِّفُوا مِنْ خَرَاجِهِ. [رواه البخاري: ٢١٠٢]

**1003.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Əbu Teybə Peyğəmbərdən ﷺ qan aldı Peyğəmbər ﷺ də (bunun müqabilində) ona bir saa xurma verməyi buyurdu. Sahiblərinə də gündəlik olaraq ondan aldıqları xəracı azaltmalarını əmr etdi." (əl-Buxari, 2102)

١٠٠٤ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: احْتَجَمَ النَّبِيُّ ﷺ وَأَعْطَى الَّذِى حَجَمَهُ، وَلَوْ كَانَ حَرَامًا لَمْ يُعْطِهِ. [رواه البخاري: ٢١٠٣]

**1004.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ qan aldırdı və qan alan adama (zəhmət haqqı) verdi. Əgər (bu işin müqabilində nə isə almaq) haram olsaydı, Peyğəmbər ﷺ ona (zəhmət haqqı) verməzdi." (əl-Buxari, 2103)

## 22-ci fəsil. (Qazanc əldə edilməsi) bəyənilməyən şeylərin alış-verişi

## ٢٢- باب: التِّجَارَةُ فِيمَا يُكْرَهُ كَسْبُهُ

١٠٠٥ – عَنْ عَائِشَةَ أُمِّ الْمُؤْمِنِينَ ﷺ أَنَّهَا اشْتَرَتْ نُمْرُقَةً فِيهَا تَصَاوِيرُ، فَلَمَّا رَآهَا رَسُولُ اللَّهِ ﷺ قَامَ عَلَى الْبَابِ، فَلَمْ يَدْخُلْهُ، فَعَرَفْتُ فِى وَجْهِهِ الْكَرَاهِيَةَ، فَقُلْتُ يَا رَسُولَ اللَّهِ، أَتُوبُ إِلَى اللَّهِ وَإِلَى رَسُولِهِ ﷺ مَاذَا أَذْنَبْتُ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَا بَالُ هَذِهِ النُّمْرُقَةِ». قُلْتُ اشْتَرَيْتُهَا لَكَ لِتَقْعُدَ عَلَيْهَا وَتَوَسَّدَهَا. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّ أَصْحَابَ هَذِهِ الصُّوَرِ يَوْمَ الْقِيَامَةِ يُعَذَّبُونَ، فَيُقَالُ لَهُمْ أَحْيُوا مَا خَلَقْتُمْ». وَقَالَ: «إِنَّ الْبَيْتَ الَّذِى فِيهِ الصُّوَرُ لاَ تَدْخُلُهُ الْمَلاَئِكَةُ». [رواه البخاري: ٢١٠٥]

**1005.** Rəvayət edilir ki, (bir dəfə) möminlərin anası Aişə ﷺ şəkillərlə bəzədilmiş bir yastıq aldı. Peyğəmbər ﷺ yastığı gördükdə qapının ağzında dayandı və içəri girmədi.

(Aişə) dedi: "Mən onun üzündən narazı olduğunu görüb dedim: "Ya Rəsulullah, mən Allaha və Onun Elçisinə tövbə[1] edirəm. Mənim günahım nədir?" Peyğəmbər ﷺ buyurdu: "Bu nə yastıqdır?!" Dedim: "Mən onu sənin üçün almışam ki, üstündə oturasan, (yatanda da) başının altına qoyasan." Peyğəmbər ﷺ buyurdu: "Bu rəsmləri çəkənlər Qiyamət günü əzaba düçar olacaqlar. Onlara deyiləcəkdir: "Yaratdıqlarınıza can verin (görək)!" Sonra da əlavə edib dedi: "İçində şəkil olan evə mələklər girməz!" (əl-Buxari, 2105)

[1] Etdiyi səhv əməldən peşman olub bu işi bir daha etməyəcəyinə söz vermə, əhd etmə.

## 23-cü fəsil. Adamın bir şey satın alıb həmin vaxt, tərəflər[1] ayrılmadan öncə onu başqasına hədiyyə etməsi

## ٢٣– باب: إِذَا اشْتَرَى شَيْئًا فَوَهَبَ مِنْ سَاعَتِهِ قَبْلَ أَنْ يَتَفَرَّقَا

١٠٠٦ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ فِي سَفَرٍ فَكُنْتُ عَلَى بَكْرٍ صَعْبٍ لِعُمَرَ، فَكَانَ يَغْلِبُنِي فَيَتَقَدَّمُ أَمَامَ الْقَوْمِ، فَيَزْجُرُهُ عُمَرُ وَيَرُدُّهُ، ثُمَّ يَتَقَدَّمُ فَيَزْجُرُهُ عُمَرُ وَيَرُدُّهُ فَقَالَ النَّبِيُّ ﷺ لِعُمَرَ: «بِعْنِيهِ». قَالَ هُوَ لَكَ يَا رَسُولَ اللَّهِ. قَالَ: «بِعْنِيهِ». فَبَاعَهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ فَقَالَ النَّبِيُّ ﷺ: «هُوَ لَكَ يَا عَبْدَ اللَّهِ بْنَ عُمَرَ تَصْنَعُ بِهِ مَا شِئْتَ». [رواه البخاري: ٢١١٥]

**1006.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxmışdıq. Mən (atam) Ömərin hürkək cavan bir dəvəsinə minmişdim. Mən onu idarə edə bilmirdim. O irəli keçir, Ömər dəvənin üstünə qışqırıb onu geri qaytarırdı. O (yenə) irəli keçərkən Ömər dəvənin üstünə qışqırıb onu geri qaytarırdı. (Axırda) Peyğəmbər ﷺ Ömərə: "Onu mənə sat!"- deyə buyurdu. Ömər dedi: "O sənindir, ya Rəsulullah!" Peyğəmbər ﷺ (yenə): "Onu mənə sat!"– deyə buyurdu. Ömər də onu Peyğəmbərə ﷺ satdı. Sonra Peyğəmbər ﷺ (mənə) dedi: "O sənindir, ey Abdullah ibn Ömər, onunla nə istəyirsənsə, edə bilərsən." (əl-Buxari, 2115)

## 24-cü fəsil. Alış-veriş etdikdə aldatmağın bəyənilməməsi

## ٢٤– باب: مَا يُكْرَهُ مِنَ الْخِدَاعِ فِي الْبَيْعِ

١٠٠٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَجُلاً ذَكَرَ لِلنَّبِيِّ ﷺ أَنَّهُ يُخْدَعُ فِي الْبُيُوعِ، فَقَالَ: «إِذَا بَايَعْتَ فَقُلْ لاَ خِلاَبَةَ». [رواه البخاري: ٢١١٧]

**1007.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət etmişdir ki, bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib alış-veriş etdikdə aldanıldığını ona xəbər verdi. Peyğəmbər ﷺ buyurdu: "Alver etdikdə (qarşı tərəfə): "Aldatmaq yoxdur!"– de." (əl-Buxari, 2117)

## 25-ci fəsil. Bazarlar[2] barəsində deyilənlər

## ٢٥– باب: مَا ذُكِرَ فِي الأَسْوَاقِ

١٠٠٨ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «يَغْزُو جَيْشٌ الْكَعْبَةَ، فَإِذَا كَانُوا بِبَيْدَاءَ مِنَ الأَرْضِ يُخْسَفُ بِأَوَّلِهِمْ وَآخِرِهِمْ». قَالَتْ: قُلْتُ يَا رَسُولَ اللَّهِ كَيْفَ يُخْسَفُ بِأَوَّلِهِمْ وَآخِرِهِمْ، وَفِيهِمْ أَسْوَاقُهُمْ وَمَنْ لَيْسَ مِنْهُمْ. قَالَ: «يُخْسَفُ بِأَوَّلِهِمْ وَآخِرِهِمْ، ثُمَّ يُبْعَثُونَ عَلَى نِيَّاتِهِمْ». [رواه البخاري: ٢١١٨]

---

[1] Burada tərəflər deyildikdə satıcı və alıcı nəzərdə tutulur.

[2] İbn Bəttal demişdir: "Müəllif "bazarlar" deməklə ticarət etməyin caiz olmasını, zadəgan insanların bazara girməsinin mümkün olmasını demək istəmiş və bazarların şər yuvası olduğuna işarə etmişdir" (Fəthul-Bari, 6/441).

**1008.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ dedi: “Bir ordu Kəbənin üzərinə hücum edəcək. (Nəhayət,) Beyda deyilən yerə gəlib çatdıqları zaman onların əvvəlincisindən axırıncısınadək (hamısı) yerə batırılacaq.[1]” Mən dedim: “Ya Rəsulullah, axı onların arasında sadə və heç kəsə qarışmayan adamlar olduğu halda, onların əvvəlincisindən axırıncısınadək (hamısı) necə yerə batırıla bilər?” Peyğəmbər ﷺ dedi: “Onların əvvəlincisindən axırıncısınadək (hamısı) yerə batırılacaq, sonra isə öz niyyətlərinə uyğun olaraq həşr olunacaqlar.” (əl-Buxari, 2118)

١٠٠٩ – عَنْ أَنَسِ بْنِ مَالِك رضي الله عنه قَالَ: كَانَ النَّبِيُّ ﷺ فِى السُّوقِ، فَقَالَ رَجُلٌ يَا أَبَا الْقَاسِمِ. فَالْتَفَتَ إِلَيْهِ النَّبِيُّ ﷺ فَقَالَ: إِنَّمَا دَعَوْتُ هَذَا. فَقَالَ النَّبِيُّ ﷺ: «سَمُّوا بِاسْمِى، وَلاَ تَكَنَّوْا بِكُنْيَتِى». [رواه البخاري: ٢١٢٠]

**1009.** Ənəs ibn Malik رضي الله عنه rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ bazarda ikən bir nəfər onu: “Ey Əbul-Qasim”– deyə çağırdı və Peyğəmbər ﷺ ona tərəf döndü. Lakin həmin adam: “Mən (sizi yox,) filankəsi çağırırdım”– dedi. Onda Peyğəmbər ﷺ buyurdu: “(Özünüzə) mənim adımı qoya bilərsiniz, lakin kunyamı[2] qoymayın.” (əl-Buxari, 2120)

١٠١٠ – عَنْ أَبِى هُرَيْرَةَ الدَّوْسِيِّ رضي الله عنه قَالَ خَرَجَ النَّبِيُّ ﷺ فِى طَائِفَةِ النَّهَارِ لاَ يُكَلِّمُنِى وَلاَ أُكَلِّمُهُ حَتَّى أَتَى سُوقَ بَنِى قَيْنُقَاعَ، فَجَلَسَ بِفِنَاءِ بَيْتِ فَاطِمَةَ فَقَالَ: «أَثَمَّ لُكَعُ أَثَمَّ لُكَعُ». فَحَبَسَتْهُ شَيْئًا فَظَنَنْتُ أَنَّهَا تُلْبِسُهُ سِخَابًا أَوْ تُغَسِّلُهُ، فَجَاءَ يَشْتَدُّ حَتَّى عَانَقَهُ وَقَبَّلَهُ، وَقَالَ: «اللَّهُمَّ أَحْبِبْهُ وَأَحِبَّ مَنْ يُحِبُّهُ». [رواه البخاري: ٢١٢٢]

**1010.** Rəvayət edilir ki, Əbu Hureyra əd-Dövsi رضي الله عنه demişdir: “(Bir dəfə) günortaüstü Peyğəmbər ﷺ (evindən) çıxdı. Nə o mənə bir söz dedi, nə də mən ona bir söz dedim. Nəhayət, gəlib Qaynuqa[3] bazarına çatdıq. O, Fatimənin evinin həyətində yerə oturdu və: “Balaca oradadırmı? Balaca oradadırmı?”– deyə soruşdu. (Fatimə) uşağı bir müddət ləngitdi. Mən onun uşağa ətirli boyunbağı taxdığını və ya onu yuyundurduğunu zənn etdim. Sonra Həsən qaçaqaça gəlib (Peyğəmbərin ﷺ qucağına atıldı), Peyğəmbər ﷺ onu qucaqlayıb öpdü və dua edib dedi: “Allahım, onu sev və onu sevən kimsələri də sev!” (əl-Buxari, 2122)

١٠١١ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُمْ كَانُوا يَشْتَرُونَ الطَّعَامَ مِنَ الرُّكْبَانِ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ فَيَبْعَثُ عَلَيْهِمْ مَنْ يَمْنَعُهُمْ أَنْ يَبِيعُوهُ حَيْثُ اشْتَرَوْهُ، حَتَّى يَنْقُلُوهُ حَيْثُ يُبَاعُ الطَّعَامُ. وَ قَالَ ابْنُ عُمَرَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ يُبَاعَ الطَّعَامُ إِذَا اشْتَرَاهُ حَتَّى يَسْتَوْفِيَهُ. [رواه البخاري: ٢١٢٣-٢١٢٤]

**1011.** İbn Ömər رضي الله عنهما rəvayət etmişdir ki, insanlar Peyğəmbərin ﷺ zamanında ərzağı şəhərə gələn karvanlardan (şəhərin kənarında) alardılar. Belə olduqda, Peyğəmbər ﷺ karvan əhlinin yanına adam göndərib onlara, (karvanın satmağa gətirdiyi) ərzaq bazara yetişincəyə qədər onu satmağı yasaq etdi.”

İbn Ömər رضي الله عنهما demişdir: “Peyğəmbər ﷺ ərzağı satın alanlara, aldıqlarını tam əllərinə almayınca onu satmağı qadağan etdi.” (əl-Buxari, 2123-2124)

[1] Yəni, yer onların hamısını udacaq.
[2] 92-ci hədisin qeydlərinə bax.
[3] 983-cü hədisin qeydlərinə bax.

## 26-cı fəsil. Bazarda ucadan qışqırmağın bəyənilməməsi

## ٢٦- باب: كَرَاهِيَةُ السَّخَبِ فِى السُّوقِ

١٠١٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرِو بْنِ الْعَاصِ رضي الله عنهما سُئِلَ عَنْ صِفَةِ رَسُولِ اللَّهِ ﷺ فِى التَّوْرَاةِ. قَالَ أَجَلْ، وَاللَّهِ إِنَّهُ لَمَوْصُوفٌ فِى التَّوْرَاةِ بِبَعْضِ صِفَتِهِ فِى الْقُرْآنِ: ﴿يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ إِنَّآ أَرْسَلْنَٰكَ شَٰهِدًا وَمُبَشِّرًا وَنَذِيرًا﴾ وَحِرْزًا لِلأُمِّيِّينَ، أَنْتَ عَبْدِى وَرَسُولِى سَمَّيْتُكَ الْمُتَوَكِّلَ، لَيْسَ بِفَظٍّ وَلاَ غَلِيظٍ وَلاَ سَخَّابٍ فِى الأَسْوَاقِ، وَلاَ يَدْفَعُ بِالسَّيِّئَةِ السَّيِّئَةَ وَلَكِنْ يَعْفُو وَيَغْفِرُ، وَلَنْ يَقْبِضَهُ اللَّهُ حَتَّى يُقِيمَ بِهِ الْمِلَّةَ الْعَوْجَاءَ بِأَنْ يَقُولُوا لاَ إِلَهَ إِلاَّ اللَّهُ. وَيَفْتَحُ بِهَا أَعْيُنًا عُمْيًا، وَآذَانًا صُمًّا، وَقُلُوبًا غُلْفًا. [رواه البخاري: ٢١٢٥]

**1012.** Rəvayət edilir ki, Abdullah ibn Amr ibn əl-Asdan ﷺ Peyğəmbərin ﷺ Tövratdakı vəsfi barədə soruşdular. O dedi: “Bəli, vallahi ki, onun Quranda vəsf edilən (bəzi) sifətləri Tövratda da vəsf edilmişdir:

“Ey Peyğəmbər! Həqiqətən, Biz səni şahid, müjdəçi, xəbərdar edən[1]” və ümmiləri[2] müdafiə edən olaraq göndərdik. Sən Mənim qulum və rəsulumsan. Sənə “Mutəvəkkil[3]” adını verdim. O *Peyğəmbər* nə sərt ürəkli, nə kobud, nə də bazarda qışqır-bağır salan birisi deyildir; pisliyi pisliklə dəf etməz, əksinə, əfv edər və bağışlayar. Onun vasitəsilə əyri yolda olan millət “Lə ilahə illəllah” deyib düzəlməyincə, Allah onu Öz yanına aparmaz; və bu (tövhid kəlməsi) sayəsində kor gözləri, kar qulaqları və bağlı qəlbləri açar.” (əl-Buxari, 2125)

## 27-ci fəsil. Həm satıcı, həm də borcunu ödəyən kəs (malı) çəkməlidir

## ٢٧- باب: الْكَيْلُ عَلَى الْبَائِعِ وَالْمُعْطِى

١٠١٣ – عَنْ جَابِرٍ رضي الله عنه قَالَ: تُوُفِّىَ عَبْدُ اللَّهِ بْنُ عَمْرِو بْنِ حَرَامٍ، وَعَلَيْهِ دَيْنٌ فَاسْتَعَنْتُ النَّبِىَّ ﷺ عَلَى غُرَمَائِهِ أَنْ يَضَعُوا مِنْ دَيْنِهِ، فَطَلَبَ النَّبِىُّ ﷺ إِلَيْهِمْ، فَلَمْ يَفْعَلُوا، فَقَالَ لِى النَّبِىُّ ﷺ: «اذْهَبْ فَصَنِّفْ تَمْرَكَ أَصْنَافًا، الْعَجْوَةَ عَلَى حِدَةٍ، وَعَذْقَ زَيْدٍ عَلَى حِدَةٍ، ثُمَّ أَرْسِلْ إِلَىَّ». فَفَعَلْتُ، ثُمَّ أَرْسَلْتُ إِلَى النَّبِىِّ ﷺ فَجَلَسَ عَلَى أَعْلاَهُ، أَوْ فِى وَسَطِهِ ثُمَّ قَالَ: «كِلْ لِلْقَوْمِ». فَكِلْتُهُمْ حَتَّى أَوْفَيْتُهُمُ الَّذِى لَهُمْ، وَبَقِىَ تَمْرِى، كَأَنَّهُ لَمْ يَنْقُصْ مِنْهُ شَىْءٌ. [رواه البخاري: ٢١٢٧]

**1013.** Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Abdullah ibn Amr ibn Həram borclu olduğu halda vəfat etdi. Mən Peyğəmbərdən ﷺ borc yiyələrinin alacaqlarının bir hissəsini bağışlamaları xüsusunda bizə kömək etməyi xahiş etdim. Peyğəmbər ﷺ onlara müraciət etdi, lakin onlar (buna) razı olmadılar. Onda Peyğəmbər ﷺ mənə dedi: “Get, xurmalarını çeşidlərə ayır: Acvə xurmasını bir qırağa, Zeyd[4] salxımlarını da bir qırağa qoy. Sonra mənə xəbər göndər.”

---

[1] Ayə belədir: “Ey Peyğəmbər! Həqiqətən, Biz səni şahid, müjdəçi və xəbərdar edən olaraq göndərdik” (əl-Əhzab surəsi, 45).

[2] 678-ci hədisin qeydlərinə bax.

[3] Təvəkkül edən.

[4] Acvə və Zeyd – xurma növləridir.

Mən belə də etdim, sonra da Peyğəmbərə ﷺ xəbər göndərdim. (Peyğəmbər ﷺ gəlib) xurmaların üst tərəfində və ya ortasında oturdu və: "(Xurmaları) borc yiyələri üçün çək!"– deyə buyurdu. Mən onlara verəcəyimi tam ödəyib qurtaranadək (xurmaları) onlar üçün çəkdim. Bundan sonra yerdə bir o qədər də xurma qaldı, sanki ondan heç bir şey əksilməmişdi." (əl-Buxari, 2127)

## 28-ci fəsil. (Malı) çəkdikdə bəyənilən davranış

## ٢٨– باب: مَا يُسْتَحَبُّ مِنَ الْكَيْلِ

١٠١٤ – عَنْ الْمِقْدَامِ بْنِ مَعْدِيكَرِبَ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: «كِيلُوا طَعَامَكُمْ يُبَارَكْ لَكُمْ». [رواه البخاري: ٢١٢٨]

**1014.** Miqdam ibn Mə'dikərib ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Ərzağınızı çəkin ki, sizin üçün bərəkətli olsun.[1]" (əl-Buxari, 2128)

## 29-cu fəsil. Peyğəmbərin saasının və muddunun[2] bərəkəti

## ٢٩– باب: بَرَكَةُ صَاعِ النَّبِيِّ ﷺ وَمُدِّهِ

١٠١٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ زَيْدٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ: «أَنَّ إِبْرَاهِيمَ حَرَّمَ مَكَّةَ، وَدَعَا لَهَا، وَحَرَّمْتُ الْمَدِينَةَ كَمَا حَرَّمَ إِبْرَاهِيمُ مَكَّةَ، وَدَعَوْتُ لَهَا فِي مُدِّهَا وَصَاعِهَا، مِثْلَ مَا دَعَا إِبْرَاهِيمُ ؑ لِمَكَّةَ». [رواه البخاري: ٢١٢٩]

**1015.** Abdullah ibn Zeyd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İbrahim Məkkəni müqəddəs yer[3] elan etmiş və ora üçün dua etmişdir. İbrahimin Məkkəni müqəddəs yer elan etdiyi kimi mən də Mədinəni müqəddəs yer elan etdim və İbrahim əleyhissəlam Məkkə üçün dua etdiyi kimi mən də Mədinənin saası və muddu üçün dua etdim." (əl-Buxari, 2129)

## 30-cu fəsil. Ərzaq mallarının satışı və ehtikar[4] barədə deyilənlər

## ٣٠– باب: مَا يُذْكَرُ فِي بَيْعِ الطَّعَامِ وَالْحُكْرَةِ

١٠١٦ – عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ: رَأَيْتُ الَّذِينَ يَشْتَرُونَ الطَّعَامَ مُجَازَفَةً يُضْرَبُونَ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ أَنْ يَبِيعُوهُ حَتَّى يُؤْوُوهُ إِلَى رِحَالِهِمْ. [رواه البخاري: ٢١٣١]

**1016.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ dövründə ərzaq mallarını tərəzidə çəkmədən (topdan) satın alan və aldıqlarını (yerindəcə satıb) satış yerinə çatdırmayan (möhtəkir) kimsələrin cəzalandırıldığını gördüm." (əl-Buxari, 2131)

---

[1] Alış-veriş etdikdə ərzağı tərəzidə düzgün çəkmək haqqında Quranda belə buyrulur: "Ölçüyə tam riayət edin və əksik ölçənlərdən olmayın. Düz tərəzi ilə çəkin. İnsanların əşyalarını əksik verməyin və yer üzündə fəsad yayaraq pis işlər görməyin. Sizi və əvvəlki nəsilləri Yaradandan qorxun!" (əş-Şuəra" surəsi, 181-184).

[2] Saa – ölçü vahididir və dörd mudda bərabərdir. Bir mudd isə insanın iki ovucuna bərabərdir. Bu da yeddi yüz qrama bərabərdir. (Səmərul Müstətab, 1/28)

[3] "Mədinənin haram sayılan ərazisi" fəslinin qeydlərinə və bu fəsildə qeyd olunmuş 902-ci hədisə bax.

[4] Mal, ərzaq və s.-ni ucuz qiymətə alıb sonradan baha qiymətlə satma işi; spekulyasiya. Bu işlə məşğul olan adama möhtəkir deyilir.

١٠١٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى أَنْ يَبِيعَ الرَّجُلُ طَعَامًا حَتَّى يَسْتَوْفِيَهُ. قِيلَ لاِبْنِ عَبَّاسٍ: كَيْفَ ذَاكَ؟ قَالَ: ذَاكَ دَرَاهِمُ بِدَرَاهِمَ وَالطَّعَامُ مُرْجَأٌ. [رواه البخاري: ٢١٣٢]

**1017.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ bir kimsənin (satın aldığı) ərzaq malına tam yiyələnməyincə onu satmağı qadağan etmişdir. (İbn Abbasdan): "Bu necə olur?"– deyə soruşdular. Dedi: "Bu, dirhəmləri dirhəmlərə (satmaq) və ərzaq malını yubatmaqdır.[1]" (əl-Buxari, 2132)

١٠١٨ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رضي الله عنه يُخْبِرُ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: «الذَّهَبُ بِالذَّهَبِ رِبًا إِلاَّ هَاءَ وَهَاءَ، وَالْبُرُّ بِالْبُرِّ رِبًا إِلاَّ هَاءَ وَهَاءَ، وَالتَّمْرُ بِالتَّمْرِ رِبًا إِلاَّ هَاءَ وَهَاءَ، وَالشَّعِيرُ بِالشَّعِيرِ رِبًا إِلاَّ هَاءَ وَهَاءَ». [رواه البخاري: ٢١٣٤]

**1018.** Ömər ibn Xəttab رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qızılı qızıla dəyişmək sələmdir. Yalnız (onun eyni miqdarda və əlbəəl dəyişdirilməsi) istisnadır. Buğdanı buğdaya dəyişmək sələmdir. Ancaq (onun eyni miqdarda və əlbəəl dəyişdirilməsi) istisnadır. Xurmanı xurmaya dəyişmək sələmdir. Təkcə (onun eyni miqdarda və əlbəəl dəyişdirilməsi) istisnadır. Arpanı arpaya dəyişmək sələmdir. Bircə (onun eyni miqdarda və əlbəəl dəyişdirilməsi) istisnadır." (əl-Buxari, 2134)

## ٣١– باب: لاَ يَبِيعُ عَلَى بَيْعِ أَخِيهِ وَلاَ يَسُومُ عَلَى سَوْمِ أَخِيهِ، حَتَّى يَأْذَنَ لَهُ أَوْ يَتْرُكَ

## **31-ci fəsil.** (Adam) **qardaşının[2] alveri üstündən alver etməməli və onun ticarət işlərinə qarışmamalıdır;** (o bunu yalnız o təqdirdə edə bilər ki,) **qardaşı ona izn versin və ya özü bundan imtina etsin**

١٠١٩ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ نَهَى رَسُولُ اللَّهِ ﷺ أَنْ يَبِيعَ حَاضِرٌ لِبَادٍ، وَلاَ تَنَاجَشُوا، وَلاَ يَبِيعُ الرَّجُلُ عَلَى بَيْعِ أَخِيهِ وَلاَ يَخْطُبُ عَلَى خِطْبَةِ أَخِيهِ، وَلاَ تَسْأَلُ الْمَرْأَةُ طَلاَقَ أُخْتِهَا لِتَكْفَأَ مَا فِي إِنَائِهَا. [رواه البخاري: ٢١٤٠]

**1019.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ şəhərliyə kəndlinin adından (onun malını) satmağı qadağan etmiş, (üstəlik demişdir): "Bir-birinizə kələk gəlmək məqsədilə malın qiymətini qaldırmayın. Kimsə qardaşının alveri üstündən alver etməsin, nişan qoyduğu qıza nişan aparmasın. Heç bir qadın da öz bacısını boşatdırıb onun yerini tutmağa çalışmasın." (əl-Buxari, 2140)

---

[1] Yəni müştəri aldığı malın pulunu ödəmədən onu bir müddət mal yiyəsinin yanında saxlayıb sonra ona müştəri tapıb bir az baha qiymətə satır və öz pulunu daha artıq pula satmış olur. Məsələn: bir nəfər mal yiyəsinə malı yüz dirhəmə alacağına vəd verir, lakin bunun müqabilində pul verməyib satıcıdan malı öz yanında saxlamağı xahiş edir, sonra da həmin mala müştəri tapıb onu yüz iyirmi dirhəmə satır və beləliklə də, o, əslində, vədə ilə aldığı malı yox, dirhəmlərini baha qiymətə satmış olur.

[2] Burada qardaş deyildikdə istənilən müsəlman nəzərdə tutulur. Bundan başqa bir çox alimlərin fikrinə görə müsəlmanların himayəsi altında olan, habelə müsəlman ölkəsində muzdla işləyən kafirlər də bu hökmə aid edilir.

## 32-ci fəsil. (Malı) hərraca[1] çıxartmaq

## ٣٢– باب: بَيْعُ الْمُزَايَدَةِ

١٠٢٠ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما أَنَّ رَجُلاً أَعْتَقَ غُلاَمًا لَهُ عَنْ دُبُرٍ، فَاحْتَاجَ فَأَخَذَهُ النَّبِيُّ ﷺ فَقَالَ: «مَنْ يَشْتَرِيهِ مِنِّى» فَاشْتَرَاهُ نُعَيْمُ بْنُ عَبْدِ اللَّهِ بِكَذَا وَكَذَا، فَدَفَعَهُ إِلَيْهِ. [رواه البخاري: ٢١٤١]

**1020.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət etmişdir ki, bir nəfər ölümündən sonra öz köləsini azad edəcəyinə qərar verdi.[2] Sonra isə ona yoxsulluq üz verdi. Peyğəmbər ﷺ o köləni götürüb: "Bunu məndən kim alar?"– deyə soruşdu. Nueym ibn Abdullah onu filan qiymətə satın aldı və Peyğəmbər ﷺ köləni ona verdi. (əl-Buxari, 2141)

## 33-cü fəsil. Əldə olmayan (malın), habelə ana bətnində olan balanın[3] satışı

## ٣٣– باب: بَيْعُ الْغَرَرِ وَحَبَلِ الْحَبَلَةِ

١٠٢١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ بَيْعِ حَبَلِ الْحَبَلَةِ، وَكَانَ بَيْعًا يَتَبَايَعُهُ أَهْلُ الْجَاهِلِيَّةِ، كَانَ الرَّجُلُ يَبْتَاعُ الْجَزُورَ إِلَى أَنْ تُنْتَجَ النَّاقَةُ، ثُمَّ تُنْتَجُ الَّتِى فِى بَطْنِهَا. [رواه البخاري: ٢١٤٣]

**1021.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ ana bətnində olan balanı satmağı qadağan etdi. Bu, cahiliyyət dövründə insanların həyata keçirdiyi bir satış növü idi. O dövrdə insanlar, dişi dəvənin bətnindəki balanın (böyüdükdən sonra) balalayacağı dəvənin (pulunu ödəyib əvvəlcədən) onu almağa qərar verərdilər." (əl-Buxari, 2143)

## 34-cü fəsil. Satıcıya dəvəni, inəyi və qoyunu sağılmamış vəziyyətdə saxlamaq qadağandır

## ٣٤– باب: النَّهْىُ لِلْبَائِعِ أَنْ لاَ يُحَفِّلَ الإِبِلَ وَالْبَقَرَ وَالْغَنَمَ

١٠٢٢ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنِ اشْتَرَى غَنَمًا مُصَرَّاةً فَاحْتَلَبَهَا، فَإِنْ رَضِيَهَا أَمْسَكَهَا، وَإِنْ سَخِطَهَا فَفِى حَلْبَتِهَا صَاعٌ مِنْ تَمْرٍ». [رواه البخاري: ٢١٥١]

**1022.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim südü sağılmamış bir qoyun alıb sağdıqdan sonra qoyun onun xoşuna gəlsə, onu özündə saxlaya bilər, xoşuna gəlməsə (və qoyunu yiyəsinə qaytarmalı olsa,) üstündə sağdığı südün qarşılığı olaraq bir saa xurma da verməlidir." (əl-Buxari, 2151)

## 35-ci fəsil. Zina etmiş kölənin satılması

## ٣٥– باب: بَيْعُ الْعَبْدِ الزَّانِى

١٠٢٣ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «إِذَا زَنَتِ الأَمَةُ فَتَبَيَّنَ زِنَاهَا فَلْيَجْلِدْهَا، وَلاَ يُثَرِّبْ، ثُمَّ إِنْ زَنَتْ فَلْيَجْلِدْهَا، وَلاَ يُثَرِّبْ، ثُمَّ إِنْ زَنَتِ الثَّالِثَةَ فَلْيَبِعْهَا، وَلَوْ بِحَبْلٍ مِنْ شَعَرٍ». [رواه البخاري: ٢١٥٢]

---

[1] Bir mülkün, şeyin ən çox pul verənə verilmək üzrə açıq satışa qoyulması; auksion, müzaidə.
[2] Köləsinə: "Mən öləndən sonra azadsan"– deyə söz verdi.
[3] Söhbət heyvanın qarnındakı balasından gedir.

**1023.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kəniz zina edərsə və bu işin üstü açılarsa, qoy (ağası) ona (əlli) çubuq vursun və onu təhqir etməsin. Əgər (bir də) zina edərsə, (yenə) ona (əlli) çubuq vursun və onu təhqir etməsin. Üçüncü dəfə zina edərsə, (əvəzində) tükdən əyrilmiş ip (almış) olsa da belə, onu satsın[1]". (əl-Buxari, 2152)

## ٣٦- باب: هَلْ يَبِيعُ حَاضِرٌ لِبَادٍ بِغَيْرِ أَجْرٍ؟ وَهَلْ يُعِينُهُ أَوْ يَنْصَحُهُ؟

## 36-cı fəsil. Şəhərli zəhmət haqqı almadan kəndlinin adından (onun malını) sata bilərmi? Şəhərli kəndliyə kömək göstərə bilərmi və ya ona nəsihət edə bilərmi?

١٠٢٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لاَ تَلَقَّوُا الرُّكْبَانَ وَلاَ يَبِيعُ حَاضِرٌ لِبَادٍ». قِيلَ لاِبْنِ عَبَّاسٍ: مَا قَوْلُهُ لاَ يَبِيعُ حَاضِرٌ لِبَادٍ قَالَ: لاَ يَكُونُ لَهُ سِمْسَارًا. [رواه البخاري: ٢١٥٨]

**1024.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Şəhərə mal gətirən) karvanı (şəhərin kənarında) qarşılamayın[2]. Qoy şəhərli kəndlinin adından (onun malını) satmasın." İbn Abbasdan soruşdular: "Şəhərli kəndlinin adından (onun malını) satmasın" nə deməkdir?" İbn Abbas dedi: "(Şəhərli) onun üçün dəllallıq[3] etməsin!" (əl-Buxari, 2158)

## ٣٧- باب: النَّهْيُ عَنْ تَلَقِّي الرُّكْبَانِ

## 37-ci fəsil. Karvanı (şəhərin kənarında) qarşılamağın qadağan olunması

١٠٢٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ يَبِيعُ بَعْضُكُمْ عَلَى بَيْعِ بَعْضٍ، وَلاَ تَلَقَّوُا السِّلَعَ حَتَّى يُهْبَطَ بِهَا إِلَى السُّوقِ». [رواه البخاري: ٢١٦٥]

**1025.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz digərinin alveri üstündən alver etməsin. (Ticarət malı gətirən) karvan bazara gəlib çatanadək, onu (şəhər kənarında) qarşılamayın!" (əl-Buxari, 2165)

## ٣٨- باب: بَيْعُ الزَّبِيبِ بِالزَّبِيبِ وَالطَّعَامِ بِالطَّعَامِ

## 38-ci fəsil. Kişmişi kişmişə, yeməyi də yeməyə dəyişmək

١٠٢٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنِ الْمُزَابَنَةِ، وَالْمُزَابَنَةُ بَيْعُ الثَّمَرِ بِالتَّمْرِ كَيْلاً، وَبَيْعُ الزَّبِيبِ بِالْكَرْمِ كَيْلاً. [رواه البخاري: ٢١٧١]

---

[1] Yəni onu tez bir zamanda dəyər-dəyməzinə satıb onu başından rədd etsin.

[2] Peyğəmbər ﷺ kəndlərdən və ya başqa məmləkətlərdən şəhərə mal gətirən kəndliləri və tacirləri şəhərin kənarında qarşılamağı ona görə qadağan etmişdir ki, yerli sakinlər onları aldatmasın. Çünki fırıldaqçı və möhtəkir alverçilər onların bazar qiymətlərindən xəbərsiz olduğundan istifadə edərək malın hamısını ucuz qiymətə onlardan alıb bazar əhlinə istədikləri baha qiymətə satırdılar.

[3] Ticarət işlərində müəyyən faiz almaq şərtilə vasitəçilik etmək.

**1026.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ müzabənəni qadağan etmişdir. Müzabənə – (təzə) xurmaların quru xurmalarla dəyişdirilməsi, habelə kişmişin üzümlə dəyişdirilməsidir. (əl-Buxari, 2171)

## 39-cu fəsil. Arpanı arpaya dəyişmək

## ٣٩– باب: بَيْعُ الشَّعِيرِ بِالشَّعِيرِ

١٠٢٧ – عَنْ مَالِك بْنِ أَوْسٍ أَنَّهُ الْتَمَسَ صَرْفًا بِمائَة دينَار، فَدَعَانى طَلْحَةُ بْنُ عُبَيْد اللَّه فَتَرَاوَضْنَا، حَتَّى اصْطَرَفَ منِّى، فَأَخَذَ الذَّهَبَ يُقَلِّبُهَا فى يَده، ثُمَّ قَالَ حَتَّى يَأْتِىَ خَازِنى منَ الْغَابَة، وَعُمَرُ يَسْمَعُ ذَلكَ، فَقَالَ وَاللَّه لاَ تُفَارِقُهُ حَتَّى تَأْخُذَ منْهُ، قَالَ رَسُولُ اللَّه ﷺ:«الذَّهَبُ بالذَّهَب ربًا إلاَّ هَاءَ وَهَاءَ، وَالْبُرُّ بالْبُرِّ ربًا إلاَّ هَاءَ وَهَاءَ، وَالشَّعِيرُ بِالشَّعِيرِ رِبًا إِلاَّ هَاءَ وَهَاءَ، وَالتَّمْرُ بِالتَّمْرِ رِبًا إِلاَّ هَاءَ وَهَاءَ». [رواه البخاري: ٢١٧٤]

**1027.** Rəvayət edilir ki, (bir dəfə) Malik ibn Əvs yüz dinarı (dirhəmə) dəyişmək istəyirdi.

(Malik ibn Əvs) dedi: "Təlhə ibn Ubeydullah məni yanına çağırdı və biz qiymət danışdıqdan sonra o, (pulu dəyişməyə) razılıq verdi. O, qızılı götürüb əlində o üz bu üzə çevirdi, sonra dedi: "Xəzinədarım Ğabədən[1] qayıdanadək (gözləməli olacaqsan[2])!" Bunu eşidən Ömər dedi: "Vallahi, (pulunu) almayınca ondan ayrılmamalısan. (Axı) Peyğəmbər ﷺ demişdir: "Qızılı qızıla dəyişmək sələmdir. Yalnız (onun eyni miqdarda və əlbəəl dəyişdirilməsi) istisnadır. Buğdanı buğdaya dəyişmək sələmdir. Ancaq (onun eyni miqdarda və əlbəəl dəyişdirilməsi) istisnadır. Arpanı arpaya dəyişmək sələmdir. Bircə (onun eyni miqdarda və əlbəəl dəyişdirilməsi) istisnadır. Xurmanı xurmaya dəyişmək sələmdir. Təkcə (onun eyni miqdarda və əlbəəl dəyişdirilməsi) istisnadır." (əl-Buxari, 2174)

## 40-cı fəsil. Qızılı qızıla dəyişmək

## ٤٠– باب: بَيْعُ الذَّهَبِ بِالذَّهَبِ

١٠٢٨ – عَنْ أَبِي بَكْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ: «لاَ تَبيعُوا الذَّهَبَ بالذَّهَب إلاَّ سَوَاءً بسَوَاءٍ، وَالْفضَّةَ بالْفضَّة إلاَّ سَوَاءً بِسَوَاءٍ، وَبِيعُوا الذَّهَبَ بِالْفِضَّةِ وَالْفِضَّةَ بِالذَّهَبِ كَيْفَ شِئْتُمْ». [رواه البخاري: ٢١٧٥]

**1028.** Əbu Bəkrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qızılı qızıla ancaq (ikisi də) eyni olduğu halda dəyişin. Gümüşü də gümüşə (ikisi də) ancaq eyni olduğu halda dəyişin. Qızılı gümüşə, gümüşü qızıla isə istədiyiniz kimi dəyişdirə bilərsiniz." (əl-Buxari, 2175)

## 41-ci fəsil. Gümüşü gümüşə dəyişmək

## ٤١– باب: بَيْعُ الْفِضَّةِ بِالْفِضَّةِ

١٠٢٩ – عَنْ أَبِى سَعيد الْخُدْرِىِّ ﷺ أَنَّ رَسُولَ اللَّه ﷺ قَالَ: «لاَ تَبيعُوا الذَّهَبَ بالذَّهَب إلاَّ مثْلاً بمثْلٍ، وَلاَ تُشفُّوا بَعْضَهَا عَلَى بَعْضٍ، وَلاَ تَبيعُوا الْوَرقَ بالْوَرقِ إلاَّ مثْلاً بمثْلٍ، وَلاَ تُشفُّوا بَعْضَهَا عَلَى بَعْضٍ، وَلاَ تَبيعُوا منْهَا غَائِبًا بِنَاجِزٍ». [رواه البخاري: ٢١٧٧]

[1] Ğabə Mədinənin iyirmi kilometrliyində yerləşən geniş bir sahədir.

[2] Təlhə bu cür mübadilə etməyin caiz olduğunu zənn etdiyi və məsələnin hökmündən xəbərsiz olduğu üçün belə demişdir.

**1029.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qızılı qızıla ancaq (ikisi də) eyni olduğu halda dəyişin və birini digərindən artıq etməyin[1]. Gümüşü də gümüşə (ikisi də) ancaq eyni olduğu halda dəyişin və birini digərindən artıq etməyin. Bir də ki, əldə olmayan (qızıl və gümüşü) əldə olana dəyişməyin[2]". (əl-Buxari, 2177)

## 42-ci fəsil. Dinarı dinara nisyə olaraq dəyişmək

## ٤٢– باب: بَيْعُ الدِّينَارِ بِالدِّينَارِ نَسأً

١٠٣٠ – عَنْ أَبِي سَعِيدِ الْخُدْرِيِّ ﷺ قَالَ: الدِّينَارُ بِالدِّينَارِ، وَالدِّرْهَمُ بِالدِّرْهَمِ، فَقِيْلَ لَهُ ابْنِ عَبَّاسٍ لا يَقُولُهُ، فَقَالَ أَبُو سَعِيدٍ لابْنِ عَبَّاسٍ: سَمِعْتَهُ مِنَ النَّبِيِّ ﷺ أَوْ وَجَدْتَهُ فِي كِتَابِ اللَّهِ؟ قَالَ كُلُّ ذَلِكَ لاَ أَقُولُ، وَأَنْتُمْ أَعْلَمُ بِرَسُولِ اللَّهِ ﷺ مِنِّي، وَلَكِنَّنِي أَخْبَرَنِي أُسَامَةُ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «لاَ رِبًا إِلاَّ فِي النَّسِيئَةِ». [رواه البخاري: ٢١٧٨–٢١٧٩]

**1030.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Dinarı dinara, dirhəmi dirhəmə[3] (dəyişmək olar)."

(Hədisi rəvayət edən Saleh) demişdir: "Mən ona dedim: "İbn Abbas belə demir axı?!" Əbu Səid ibn Abbasdan: "Sən bunu Peyğəmbərdən ﷺ eşitmisən, yoxsa Allahın Kitabında tapmısan?"– deyə soruşdu. İbn Abbas dedi: "Bu mənim sözüm deyil. Siz Allahın Elçisini ﷺ məndən yaxşı tanıyırsınız. Mən ancaq Usamənin mənə rəvayət etdiyini deyə bilərəm ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Sələm ancaq nisyə alverdədir"[4]. (əl-Buxari, 2178-2179)

## 43-cü fəsil. Qızılı nisyə olaraq gümüşlə dəyişdirmək

## ٤٣– باب: بَيْعُ الْوَرِقِ بِالذَّهَبِ نَسِيئَةً

١٠٣١ – عَنْ أَبِي الْمِنْهَالِ قَالَ: سَأَلْتُ الْبَرَاءَ بْنَ عَازِبٍ وَزَيْدَ بْنَ أَرْقَمَ ﷺ عَنِ الصَّرْفِ، فَكُلُّ وَاحِدٍ مِنْهُمَا يَقُولُ هَذَا خَيْرٌ مِنِّي. فَكِلاَهُمَا يَقُولُ نَهَى رَسُولُ اللَّهِ ﷺ عَنْ بَيْعِ الذَّهَبِ بِالْوَرِقِ دَيْنًا. [رواه البخاري: ٢١٨٠–٢١٨١]

**1031.** Rəvayət edilir ki, Əbu Minhal demişdir: "Mən Bəra ibn Azibdən və Zeyd ibn Ərqamdan mübadilə barəsində soruşdum. Onların hər biri (digəri haqqında): "O məndən yaxşı (bilir)"– dedi, sonra ikisi də eyni cavabı verdi: "Peyğəmbər ﷺ qızılı borc olaraq gümüşlə dəyişdirməyi qadağan etmişdir." (əl-Buxari, 2180-2181)

---

[1] Yəni, az verib çox almayın, yaxud əksinə, çox verib az almayın.

[2] Bununla Peyğəmbər ﷺ qızılın və gümüşün nisyə olaraq alınmasını və ya satılmasını qadağan etmişdir. Bu mübadilə yalnız əlbəəl olmalıdır.

[3] Qeyd etmək lazımdır ki, burada dinar və dirhəm deyildikdə, bunların dəyərindən başqa çəkisi də nəzərdə tutulur. Yəni həmin çəkidə olan malları dəyişdirmək olar.

[4] Bu ancaq eyni cinsdən olan malların mübadiləsinə aiddir. 988-ci, 1018-ci, 1027-ci, 1028-ci, 1029-cu, 1031-ci və 1032-ci hədislərə bax.

## 44-cü fəsil. Müzabənə[1]

## ٤٤- باب: بَيْعُ الْمُزَابَنَةِ

١٠٣٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ تَبِيعُوا الثَّمَرَ حَتَّى يَبْدُوَ صَلاَحُهُ، وَلاَ تَبِيعُوا الثَّمَرَ بِالتَّمْرِ» قَالَ: وَأَخْبَرَنِي زَيْدُ بْنُ ثَابِتٍ أَنَّ رَسُولَ اللَّهِ ﷺ رَخَّصَ بَعْدَ ذَلِكَ فِى بَيْعِ الْعَرِيَّةِ بِالرُّطَبِ أَوْ بِالتَّمْرِ، وَلَمْ يُرَخِّصْ فِى غَيْرِهِ. [رواه البخاري: ٢١٨٣-٢١٨٤]

**1032.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Xurmanın yetişdiyi bəlli olmayınca, onu satmayın və (təzə) xurmaları quru xurmalarla dəyişdirməyin."

Zeyd ibn Sabit mənə xəbər vermişdir ki, sonradan Peyğəmbər ﷺ (ehtiyacı olan kasıblara) əllərində olan xurmaları[2] istər təzə xurmalarla, istərsə də qurudulmuş xurmalarla dəyişməyə rüsxət verdi. Digərlərinə isə rüsxət vermədi. (əl-Buxari, 2183-2184)

## 45-ci fəsil. Xurmalar ağacda ikən (onları) qızıl və gümüşə satmaq

## ٤٥- باب: بَيْعُ الثَّمَرِ عَلَى رُءُوسِ النَّخْلِ بِالذَّهَبِ وَالْفِضَّةِ

١٠٣٣ – عَنْ جَابِرٍ رضي الله عنه قَالَ: نَهَى النَّبِيُّ ﷺ عَنْ بَيْعِ الثَّمَرِ حَتَّى يَطِيبَ، وَلاَ يُبَاعُ شَيْءٌ مِنْهُ إِلاَّ بِالدِّينَارِ وَالدِّرْهَمِ إِلاَّ الْعَرَايَا. [رواه البخاري: ٢١٨٩]

**1033.** Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ meyvə yetişənədək onu satmağı qadağan etmişdi. Bunu da dinar və dirhəmdən başqa bir şeylə mübadilə etmək olmazdı. Yalnız "ərayə"dən başqa.[3]" (əl-Buxari, 2189)

١٠٣٤ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ النَّبِيَّ ﷺ رَخَّصَ فِى بَيْعِ الْعَرَايَا فِى خَمْسَةِ أَوْسُقٍ أَوْ دُونَ خَمْسَةِ أَوْسُقٍ. [رواه البخاري: ٢١٩٠]

**1034.** Əbu Hureyra رضي الله عنه rəvayət etmişdir ki, Peyğəmbər ﷺ "əraya" mübadiləsində[4] beş vəsq[5] və ya bundan az miqdarda olan xurmaların dəyişdirilməsinə rüsxət vermişdir. (əl-Buxari, 2190)

---

[1] 1026-cı hədisə bax.

[2] Ərəbcə buna "əriyyə" və ya "əraya" deyilir. Gəlin mübadilənin bu növünü daha yaxşı başa düşmək üçün alimlərdən birinin çəkdiyi məsələ nəzər salaq. Alim demişdir: "Deyək ki, bir adamın keçən ildən qalmış qurudulmuş xurmaları var, özünün də təzə xurma almağa bir dirhəm də olsun belə pulu yoxdur və bu adam hamı kimi təzə xurmadan dadmaq istəyir. Belə olduğu halda şəriət ona, novbar meyvəyə tamarzı qalmasın deyə quru xurma verib əvəzində təzə xurma almağa rüsxət vermişdir ki, buna da "əraya" deyilir. Özündə qurudulmuş xurmalardan başqa bir şeyi olmayan həmin kasıb adam xurma bağına gəlib quru xurmalarla ağacdakı təzə xurmaları dəyişdirə bilər. Lakin qeyd etmək lazımdır ki, bütün bunlar ancaq aşağıdakı şərtlər olduğu təqdirdə tətbiq oluna bilər:

– mübadilə etmək istəyən kasıb adamın təzə xurma almaq üçün özündə olan quru xurmalardan başqa əlində heç bir vəsaiti olmasın;

– mübadilə olunan xurmaların çəkisi beş vəsqdən artıq olmasın; (bir vəsq 60 saaya, bir saa isə 2,40 kiloqrama bərabərdir "Şərh Zadul-Müstəğna", 6/104).

– xurmalardan başı çıxan mahir bir bağban çağırtdırıb mübadilə olunan təzə xurmaların quruduqdan sonra təxminən neçə saa olacağını təyin etmək;

– kasıbın, həqiqətən də, təzə xurmaya ehtiyacı olsun və bununla başqa məqsəd güdməsin;

– təzə xurmalar ağacdan dərilməmiş olsun." (Zadul-Müstəqna, 8/408)

[3] Əvvəlki hədisin qeydlərinə bax.

[4] 1032-ci hədisin qeydlərinə bax.

[5] 708-ci hədisin qeydlərinə bax.

## ٤٦– باب: بَيْعُ الثِّمَارِ قَبْلَ أَنْ يَبْدُوَ صَلاَحُهَا

## 46-cı fəsil. Meyvənin yetişdiyi bəlli olmadan onu satmaq

١٠٣٥ – (أ)– عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ﷺ قَالَ: كَانَ النَّاسُ فِى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ يَتَبَايَعُونَ الثِّمَارَ، فَإِذَا جَدَّ النَّاسُ وَحَضَرَ تَقَاضِيهِمْ قَالَ الْمُبْتَاعُ إِنَّهُ أَصَابَ الثَّمَرَ الدُّمَانُ أَصَابَهُ مُرَاضٌ أَصَابَهُ قُشَامٌ – عَاهَاتٌ يَحْتَجُّونَ بِهَا – فَقَالَ رَسُولُ اللَّهِ ﷺ لَمَّا كَثُرَتْ عِنْدَهُ الْخُصُومَةُ فِى ذَلِكَ: «فَإِمَّا لاَ فَلاَ يَتَبَايَعُوا حَتَّى يَبْدُوَ صَلاَحُ الثَّمَرِ». كَالْمَشُورَةِ يُشِيرُ بِهَا لِكَثْرَةِ خُصُومَتِهِمْ. [رواه البخاري: ٢١٩٣]

**1035.** (a) – Rəvayət edilir ki, Zeyd ibn Sabit ﷺ demişdir: "İnsanlar Peyğəmbərin ﷺ zamanında (hələ yetişməmiş) xurmanın alverini edirdilər. (Bağ sahibləri xurmaları) yığdıqları və sifarişçilər (sifariş etdiyi malı almağa) gəldikləri zaman müştəri: "Xurmalar çürüyüb, onlara xəstəlik düşüb, onlar kaldır"– deyib (pullarını geri almaq məqsədilə) höcətləşərdi. Bu məsələ ilə bağlı iddiaçıların sayı artıqda Peyğəmbər ﷺ buyurdu: "Belə olmasın deyə, meyvənin yetişdiyi bəlli olanadək onu satmayın!"

Bu onların həddindən çox mübahisə etdiklərinə bir işarə idi. (əl-Buxari, 2190)

١٠٣٥ – (ب)– عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ تُبَاعَ الثَّمَرَةُ حَتَّى تُشَقِّحَ. فَقِيلَ مَا تُشَقِّحُ قَالَ تَحْمَارُّ وَتَصْفَارُّ وَيُؤْكَلُ مِنْهَا. [رواه البخاري: ٢١٩٦]

**1035.** (b) – Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Xurmalar qızarıb və ya saralıb yeməli olmayınca onları satmağı Peyğəmbər ﷺ qadağan etmişdir." (əl-Buxari, 2196)

## ٤٧– باب: إِذَا بَاعَ الثِّمَارَ قَبْلَ أَنْ يَبْدُوَ صَلاَحُهَا ثُمَّ أَصَابَتْهُ عَاهَةٌ فَهُوَ مِنَ الْبَائِعِ

## 47-ci fəsil. Bir kimsə meyvənin yetişdiyi bəlli olmazdan əvvəl onu satar, sonra da meyvələrə bir xəstəlik düşərsə, (buna görə məsuliyyəti) satan adam daşımalıdır

١٠٣٦ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ بَيْعِ الثِّمَارِ حَتَّى تُزْهِىَ، فَقِيلَ لَهُ وَمَا تُزْهِى قَالَ حَتَّى تَحْمَرَّ، فَقَالَ: «أَرَأَيْتَ إِذَا مَنَعَ اللَّهُ الثَّمَرَةَ، بِمَ يَأْخُذُ أَحَدُكُمْ مَالَ أَخِيهِ». [رواه البخاري: ٢١٩٨]

**1036.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ xurmalar yetişənədək onları satmağı qadağan etdi. (Bir nəfər) ondan: "Yetişənədək nədir?"– deyə soruşdu. O: "(Yəni) qızaranadək"– deyə buyurdu. Sonra (buna əlavə edib) dedi: "De görüm, əgər (ağac) Allahın istəyi ilə bar verməsə, siz nəyin əsasında qardaşınızın malını alacaqsınız?!" (əl-Buxari, 2198)

## ٤٨– باب: إِذَا أَرَادَ بَيْعَ تَمْرٍ بِتَمْرٍ خَيْرٍ مِنْهُ

## 48-ci fəsil. Xurmanı daha yaxşı xurma ilə dəyişmək

١٠٣٧ – عَنْ أَبِى سَعِيدٍ الْخُدْرِىِّ وَعَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ اسْتَعْمَلَ رَجُلاً عَلَى خَيْبَرَ، فَجَاءَهُ بِتَمْرٍ جَنِيبٍ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَكُلُّ تَمْرِ خَيْبَرَ هَكَذَا». قَالَ لاَ وَاللَّهِ يَا رَسُولَ اللَّهِ، إِنَّا لَنَأْخُذُ الصَّاعَ مِنْ هَذَا

بِالصَّاعَيْنِ، وَالصَّاعَيْنِ بِالثَّلاَثَةِ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «لاَ تَفْعَلْ، بِعِ الْجَمْعَ بِالدَّرَاهِمِ، ثُمَّ ابْتَعْ بِالدَّرَاهِمِ جَنِيبًا». [رواه البخاري: ٢٢٠١-٢٢٠٢]

**1037.** Əbu Səid əl-Xudri və Əbu Hureyra ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ bir nəfəri Xeybərə əmir təyin etdi. O adam Peyğəmbərə ﷺ cənib[1] xurmaları gətirdikdə Peyğəmbər ﷺ soruşdu: "Xeybərin bütün xurmaları belədir?" Adam: "Vallahi, xeyr, ya Rəsulullah! Biz iki saa (başqa xurmadan) verib əvəzində bir saa (bu xurmadan), həmçinin üç saa (başqa xurmadan) verib əvəzində iki saa (bu xurmadan) götürürük"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Belə etmə! Əvvəlcə (əlində olan) xurmaları dirhəmə[2] sat, sonra da cənibi dirhəmlə al." (əl-Buxari, 2201-2202)

## 49-cu fəsil. Müxadərə[3]

## ٤٩– باب: بَيْعُ الْمُخَاضَرَةِ

١٠٣٨ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّهُ قَالَ نَهَى رَسُولُ اللَّهِ ﷺ عَنِ الْمُحَاقَلَةِ، وَالْمُخَاضَرَةِ، وَالْمُلاَمَسَةِ، وَالْمُنَابَذَةِ، وَالْمُزَابَنَةِ. [رواه البخاري: ٢٢٠٧]

**1038.** Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ "mühaqələni[4]", "müxadərəni", "mülaməsəni[5]", "münabəzəni[6]" və "müzabənəni[7]" qadağan etmişdir. (əl-Buxari, 2207)

## 50-ci fəsil. Yerli əhalinin adətinə uyğun olan alış-veriş, icarə, tərəzidə çəkmək və ölçmək üsulu ilə məmləkətdə iş aparan kimsə

## ٥٠– باب: مَنْ أَجْرَى أَمْرَ الأَمْصَارِ عَلَى مَا يَتَعَارَفُونَ بَيْنَهُمْ فِي الْبُيُوعِ وَالإِجَارَةِ وَالْمِكْيَالِ، وَالْوَزْنِ

١٠٣٩ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ هِنْدٌ أُمُّ مُعَاوِيَةَ لِرَسُولِ اللَّهِ ﷺ إِنَّ أَبَا سُفْيَانَ رَجُلٌ شَحِيحٌ، فَهَلْ عَلَيَّ جُنَاحٌ أَنْ آخُذَ مِنْ مَالِهِ سِرًّا قَالَ: «خُذِي أَنْتِ وَبَنُوكِ مَا يَكْفِيكِ بِالْمَعْرُوفِ». [رواه البخاري: ٢٢١١]

**1039.** Aişə ﵂ rəvayət etmişdir ki, (bir dəfə) Müaviyənin anası Hind Peyğəmbərə ﷺ dedi: "Əbu Süfyan[8] xəsis adamdır. Əgər mən onun malından gizlincə götürsəm, mənə günah sayılarmı?" Peyğəmbər ﷺ buyurdu: "Adətən, sənə bəs edəcək qədər özün də götür, oğlanların da (götürsünlər)!" (əl-Buxari, 2211)

---

[1] Söhbət seçilmiş əla növ xurmadan gedir.
[2] Burada təkcə dirhəm yox, istənilən pul vahidi nəzərdə tutulur.
[3] Meyvələrin yetişdiyi bəlli olmamış məhsulun satışı.
[4] Yetişməmiş dənli bitkiləri (hələ sünbüldə ikən) yetişmiş dənli bitkilərə dəyişmək.
[5] Malı gözlə görmədən, sadəcə ona əl vurmaqla, onu lazımınca yoxlamayıb razılaşaraq aparılan alış-veriş.
[6] Satıcının öz malını alıcının üstünə ataraq, alıcının da öz malını satıcının üstünə ataraq mallarını yoxlamadan dəyişdirmək.
[7] Təzə xurmaların quru xurmalarla, habelə kişmişin üzümlə dəyişdirilməsi, yəni təzə meyvənin köhnə meyvə ilə dəyişdirilməsi.
[8] Əbu Süfyan ﵁ Hindin ﵂ əridir.

## ٥١- باب: بَيْعُ الشَّرِيكِ مِنْ شَرِيكِهِ

## 51-ci fəsil. Şəriklərdən birinin (öz payına düşən) malını digərinə satması

١٠٤٠ – عَنْ جَابِرٍ ﷺ جَعَلَ رَسُولُ اللَّهِ ﷺ الشُّفْعَةَ فِي كُلِّ مَالٍ لَمْ يُقْسَمْ، فَإِذَا وَقَعَتِ الْحُدُودُ وَصُرِّفَتِ الطُّرُقُ فَلاَ شُفْعَةَ. [رواه البخاري: ٢٢١٣]

**1040.** Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ hər bir bölünməyən malın[1] alınmasında (şərikin) daha çox haqqı olduğuna hökm vermişdir. Əgər sərhədlər çəkilmiş və yollar bəlli edilmişsə, (malın satılmasında) şəriklik haqqı yoxdur. (əl-Buxari, 2213)

## ٥٢- باب: شِرَاءُ الْمَمْلُوكِ مِنَ الْحَرْبِيِّ وَهِبَتُهُ وَعِتْقُهُ

## 52-ci fəsil. Düşməndən kölə almaq; habelə onun hədiyyə verməsi və ya kölə azad etməsi

١٠٤١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ قَالَ النَّبِيُّ ﷺ: «هَاجَرَ إِبْرَاهِيمُ بِسَارَةَ، فَدَخَلَ بِهَا قَرْيَةً فِيهَا مَلِكٌ مِنَ الْمُلُوكِ، أَوْ جَبَّارٌ مِنَ الْجَبَابِرَةِ، فَقِيلَ دَخَلَ إِبْرَاهِيمُ بِامْرَأَةٍ، هِيَ مِنْ أَحْسَنِ النِّسَاءِ. فَأَرْسَلَ إِلَيْهِ أَنْ يَا إِبْرَاهِيمُ، مَنْ هَذِهِ الَّتِي مَعَكَ قَالَ أُخْتِي. ثُمَّ رَجَعَ إِلَيْهَا، فَقَالَ لاَ تُكَذِّبِي حَدِيثِي فَإِنِّي أَخْبَرْتُهُمْ أَنَّكِ أُخْتِي، وَاللَّهِ إِنْ عَلَى الأَرْضِ مُؤْمِنٌ غَيْرِي وَغَيْرُكِ. فَأَرْسَلَ بِهَا إِلَيْهِ، فَقَامَ إِلَيْهَا، فَقَامَتْ تَوَضَّأُ وَتُصَلِّي فَقَالَتِ اللَّهُمَّ إِنْ كُنْتُ آمَنْتُ بِكَ وَبِرَسُولِكَ وَأَحْصَنْتُ فَرْجِي، إِلاَّ عَلَى زَوْجِي فَلاَ تُسَلِّطْ عَلَيَّ الْكَافِرَ. فَغُطَّ حَتَّى رَكَضَ بِرِجْلِهِ».
أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ قَالَ أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ قَالَتِ اللَّهُمَّ إِنْ يَمُتْ يُقَالُ هِيَ قَتَلَتْهُ. فَأُرْسِلَ ثُمَّ قَامَ إِلَيْهَا، فَقَامَتْ تَوَضَّأُ تُصَلِّي، وَتَقُولُ اللَّهُمَّ إِنْ كُنْتُ آمَنْتُ بِكَ وَبِرَسُولِكَ، وَأَحْصَنْتُ فَرْجِي، إِلاَّ عَلَى زَوْجِي، فَلاَ تُسَلِّطْ عَلَيَّ هَذَا الْكَافِرَ، فَغُطَّ حَتَّى رَكَضَ بِرِجْلِهِ.
قَالَ أَبُو هُرَيْرَةَ فَقَالَتِ اللَّهُمَّ إِنْ يَمُتْ فَيُقَالُ هِيَ قَتَلَتْهُ، فَأُرْسِلَ فِي الثَّانِيَةِ، أَوْ فِي الثَّالِثَةِ، فَقَالَ وَاللَّهِ مَا أَرْسَلْتُمْ إِلَيَّ إِلاَّ شَيْطَانًا، ارْجِعُوهَا إِلَى إِبْرَاهِيمَ، وَأَعْطُوهَا آجَرَ. فَرَجَعَتْ إِلَى إِبْرَاهِيمَ عليه السلام فَقَالَتْ أَشَعَرْتَ أَنَّ اللَّهَ كَبَتَ الْكَافِرَ وَأَخْدَمَ وَلِيدَةً. [رواه البخاري: ٢٢١٧]

**1041.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İbrahim (zövcəsi) Sara ilə birlikdə hicrət edib qəddar bir padşahın məmləkətinə gəlib çatdıqda (padşaha) xəbər verdilər ki, İbrahim ən gözəl qadınlardan biri ilə şəhərə gəlib. Padşah onun yanına adam göndərdi (ki, ondan soruşsun): "Ey İbrahim, yanındakı bu qadın kimdir?" İbrahim: "Bacımdır!"– deyə cavab verdi. Sonra (Saranın) yanına gəlib dedi: "Mənim dediyimi təkzib etmə. Mən onlara dedim ki, sən mənim bacımsan. Vallahi ki, yer üzündə bizim ikimizdən başqa mömin olan bir kimsə yoxdur." Sonra İbrahim Saranı padşahın yanına göndərdi. Padşah Saraya tərəf gəldikdə o, ayağa qalxdı, dəstəmaz alıb namaz qıldı və dua edib dedi: "Allahım, mən Sənə və Sənin Peyğəmbərinə iman gətirmişəmsə və ismətimi ancaq ərim üçün qoruyub saxlamışamsa, məni bu kafirin ixtiyarına buraxma!" Padşah xırıldadı və ayaqları əsməyə başladı."

---

[1] Digər bir hədisdə buyurmuşdur: "Torpaq, malikanə və divar kimi hər bir bölünməyən şərikli malın alınmasında (şərikin) daha çox haqqı vardır. Şəriklərdən heç biri (malın öz payına düşən hissəsini) digərinə təklif etmədən (şərik olmayan başqa birisinə) satmamalıdır. Şəriki də istər onu alar, istərsə də, ondan imtina edər..." "Səhih Muslim", 10/453, 4214-cü hədis.

Əbu Sələmə ibn Abdur-Rəhman rəvayət edir ki, Əbu Hureyra ﷺ demişdir: "Sara: "Allahım, əgər (bu) ölsə, deyəcəklər ki, onu mən öldürmüşəm"– deyə dua etdi və padşah özünə gəldi. Sonra Padşah (yenə) ona yaxınlaşmaq istədi. Sara (təzədən) dəstəmaz alıb namaz qıldı və dua edib dedi: "Allahım, mən Sənə və Sənin Peyğəmbərinə iman gətirmişəmsə və ismətimi yalnız ərim üçün qoruyub saxlamışamsa, məni bu kafirin ixtiyarına vermə!" Padşah (yenə) xırıldadı və ayaqları əsməyə başladı."

Əbu Hureyra ﷺ demişdir: "Sara: "Allahım, əgər (bu) ölsə, deyəcəklər ki, onu mən öldürmüşəm"– dedi. Padşah ikinci (və ya üçüncü) dəfə özünə gəldi və (gözətçilərini çağırıb) dedi: "Vallahi, siz mənim yanıma (insan yox,) şeytan göndərmisiniz. Onu İbrahimə qaytarın, üstəlik Acarı[1] da ona bağışlayın." (Bu hadisədən) sonra Sara İbrahimin yanına qayıdıb dedi: "Gördün, Allah kafiri necə rüsvay etdi və (mənə də) xidmətçi bir kəniz bəxş etdi?" (əl-Buxari, 2217)

## 53-cü fəsil. Donuzların məhv edilməsi

## ٥٣– باب: قَتْلُ الْخِنْزِيرِ

١٠٤٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «وَالَّذِى نَفْسِى بِيَدِهِ لَيُوشِكَنَّ أَنْ يَنْزِلَ فِيكُمُ ابْنُ مَرْيَمَ حَكَمًا مُقْسِطًا فَيَكْسِرَ الصَّلِيبَ، وَيَقْتُلَ الْخِنْزِيرَ، وَيَضَعَ الْجِزْيَةَ، وَيَفِيضَ الْمَالُ حَتَّى لاَ يَقْبَلَهُ أَحَدٌ». [رواه البخاري: ٢٢٢٢]

**1042.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Canım Əlində olan Allaha and olsun ki, tezliklə Məryəm oğlu (İsa) aranızda ədalətlə hökm vermək üçün sizin yanınıza enib xaçları sındıracaq, donuzları məhv edəcək və cizyəni[2] aradan qaldıracaq. (Həmin vaxt) mal-dövlət o qədər artacaq ki, heç kəs sədəqə götürmək istəməyəcək." (əl-Buxari, 2222)

## 54-cü fəsil. Canlı olmayan şeylərə aid rəsmlərin satılması və bu xüsusda olan bəzi bəyənilməyən məsələlər

## ٥٤– باب: بَيْعُ التَّصَاوِيرِ الَّتِى لَيْسَ فِيهَا رُوحٌ وَمَا يُكْرَهُ مِنْ ذَلِكَ

١٠٤٣ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّهُ أَتَاهُ رَجُلٌ فَقَالَ: يَا أَبَا عَبَّاسٍ إِنِّى إِنْسَانٌ، إِنَّمَا مَعِيشَتِى مِنْ صَنْعَةِ يَدِى، وَإِنِّى أَصْنَعُ هَذِهِ التَّصَاوِيرَ. فَقَالَ ابْنُ عَبَّاسٍ: لاَ أُحَدِّثُكَ إِلاَّ مَا سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ سَمِعْتُهُ يَقُولُ: «مَنْ صَوَّرَ صُورَةً فَإِنَّ اللَّهَ مُعَذِّبُهُ، حَتَّى يَنْفُخَ فِيهَا الرُّوحَ، وَلَيْسَ بِنَافِخٍ فِيهَا أَبَدًا». فَرَبَا الرَّجُلُ رَبْوَةً شَدِيدَةً وَاصْفَرَّ وَجْهُهُ. فَقَالَ وَيْحَكَ إِنْ أَبَيْتَ إِلاَّ أَنْ تَصْنَعَ، فَعَلَيْكَ بِهَذَا الشَّجَرِ، كُلِّ شَىْءٍ لَيْسَ فِيهِ رُوحٌ. [رواه البخاري: ٢٢٢٥]

**1043.** Rəvayət edilir ki, bir dəfə bir nəfər ibn Abbasın رضي الله عنهما yanına gəlib dedi: "Ey Əbu Abbas, mən insanam; mənim dolanışığım əl işlərimdən çıxır; mən bu rəsmləri çəkirəm." İbn Abbas dedi: "Mən sənə ancaq Peyğəmbərdən ﷺ eşitdiyimi danışacağam. Mən onun belə dediyini eşitmişəm: "Kim rəsm çəkərsə[3], (o adam) həmin rəsmə ruh üfürənə qədər Allah ona əzab verər. O isə heç

---

[1] Hədisdə Acar deyildikdə İsmayılın عليه السلام anası Hacər عليها السلام nəzərdə tutulur.
[2] Müsəlman dövlətinin himayəsi altında yaşayan qeyri-müsəlmanlardan alınan mal və ya can vergisi.
[3] Söhbət canlı məxluqların rəsmindən gedir.

vaxt ona ruh üfürə bilməyəcək." O adam dərindən ah çəkdi və (qorxudan) onun rəngi saraldı. İbn Abbas dedi: "Ay biçarə! Çəkmək istəyirsənsə, ağac və başqa cansız şeylərin şəklini çək." (əl-Buxari, 2225)

## ٥٥- باب: إِثْمُ مَنْ بَاعَ حُرًّا

## 55-ci fəsil. Azad insanı (qul kimi) satan kimsənin günahı

١٠٤٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «قَالَ اللَّهُ ثَلاَثَةٌ أَنَا خَصْمُهُمْ يَوْمَ الْقِيَامَةِ، رَجُلٌ أَعْطَى بِي ثُمَّ غَدَرَ، وَرَجُلٌ بَاعَ حُرًّا فَأَكَلَ ثَمَنَهُ، وَرَجُلٌ اسْتَأْجَرَ أَجِيرًا فَاسْتَوْفَى مِنْهُ، وَلَمْ يُعْطِ أَجْرَهُ». [رواه البخاري: ٢٢٢٧]

**1044.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah buyurmuşdur: "Üç adam (var ki) Qiyamət günü Mən onlara qarşı iddiaçı olacağam:
– Mənim adımdan and içib sonra andını pozan adam;
– azad insanı satıb pulunu yeyən adam;
– işçi tutub ondan işini tamam-kamal yerinə yetirməyi tələb edib (axırda da) zəhmət haqqını verməyən adam." (əl-Buxari, 2227)

## ٥٦- باب: بَيْعُ الْمَيْتَةِ وَالأَصْنَامِ

## 56-cı fəsil. Ölü heyvan və büt satmaq

١٠٤٥ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ عَامَ الْفَتْحِ، وَهُوَ بِمَكَّةَ: «إِنَّ اللَّهَ وَرَسُولَهُ حَرَّمَ بَيْعَ الْخَمْرِ وَالْمَيْتَةِ وَالْخِنْزِيرِ وَالأَصْنَامِ». فَقِيلَ يَا رَسُولَ اللَّهِ، أَرَأَيْتَ شُحُومَ الْمَيْتَةِ فَإِنَّهَا يُطْلَى بِهَا السُّفُنُ، وَيُدْهَنُ بِهَا الْجُلُودُ، وَيَسْتَصْبِحُ بِهَا النَّاسُ. فَقَالَ: «لاَ، هُوَ حَرَامٌ». ثُمَّ قَالَ رَسُولُ اللَّهِ ﷺ عِنْدَ ذَلِكَ: «قَاتَلَ اللَّهُ الْيَهُودَ، إِنَّ اللَّهَ لَمَّا حَرَّمَ شُحُومَهَا جَمَلُوهُ ثُمَّ بَاعُوهُ فَأَكَلُوا ثَمَنَهُ». [رواه البخاري: ٢٢٣٦]

**1045.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ Məkkənin fəth edildiyi il Peyğəmbərin ﷺ Məkkədə ikən belə dediyini eşitmişdir: "Allah və Onun elçisi şərabın, ölü heyvanın, donuzun və bütlərin satılmasını haram etmişdir." (Ona) dedilər: "Ya Rəsulullah, gəmilərin (böyürlərinin və altının) cilalanması, dərilərin yağlanması və (evlərin və s.) işıqlandırılması üçün istifadə edilən ölü heyvanın piyi haqqında nə deyə bilərsən?" Peyğəmbər ﷺ: "Xeyr, bu haramdır!"– deyə buyurdu, sonra da əlavə edib dedi: "Allah yəhudiləri məhv etsin! Allah onlara heyvanın piyindən (istifadə etməyi) haram buyurduqda, onlar onu əridib satdılar və pulunu yedilər." (əl-Buxari, 2236)

## ٥٧- باب: ثَمَنُ الْكَلْبِ

## 57-ci fəsil. İtin müqabilində pul almaq

١٠٤٦ – عَنْ أَبِي مَسْعُودٍ الأَنْصَارِيِّ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ ثَمَنِ الْكَلْبِ وَمَهْرِ الْبَغِيِّ وَحُلْوَانِ الْكَاهِنِ. [رواه البخاري: ٢٢٣٧]

**1046.** Əbu Məsud əl-Ənsari ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ itin müqabilində verilən pulu, zinakar qadının qazandığı pulu və kahinə verilən pulu götürməyi qadağan etmişdir." (əl-Buxari, 2237)

# ٣٦ – كِتَابُ السَلَمِ

# 36 – İlkin ödəniş kitabı

## ١ – باب: السَّلَمُ فِى كَيْلٍ مَعْلُومٍ

## 1-ci fəsil. Müəyyən çəkiyə görə qabaqcadan ödəniş etmək

١٠٤٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَدِمَ رَسُولُ اللَّهِ ﷺ الْمَدِينَةَ، وَالنَّاسُ يُسْلِفُونَ فِى الثَّمَرِ الْعَامَ وَالْعَامَيْنِ فَقَالَ: «مَنْ سَلَّفَ فِى تَمْرٍ فَلْيُسْلِفْ فِى كَيْلٍ مَعْلُومٍ، وَوَزْنٍ مَعْلُومٍ». [رواه البخاري: ٢٢٣٩]
وَ فِي رِوَايَةٍ: «إِلَى أَجَلٍ مَعْلُومٍ» [رواه البخاري: ٢٢٤٠]

**1047.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: “Peyğəmbər ﷺ Mədinəyə gəldiyi zaman (Mədinə) sakinləri bir il və ya iki ildən sonra alacaqları xurmanın pulunu qabaqcadan ödəyərdilər. Onda Peyğəmbər ﷺ buyurdu: “Hər kim (alacağı xurmanın) pulunu qabaqcadan ödəmək istəyirsə, qoy müəyyən edilmiş çəkisinə və miqdarına görə (pul) ödəsin!” (əl-Buxari, 2239)

Digər rəvayətdə demişdir: “Təyin edilmiş vaxtda (veriləcəyinə) görə” (əl-Buxari, 2240)

١٠٤٨ – عَنْ ابْنِ أَبِى أَوْفَى رضي الله عنهما قَالَ: إِنَّا كُنَّا نُسْلِفُ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ وَأَبِى بَكْرٍ وَعُمَرَ، فِى الْحِنْطَةِ وَالشَّعِيرِ وَالزَّبِيبِ وَالتَّمْرِ. [رواه البخاري: ٢٢٤٢-٢٢٤٣]

**1048.** Rəvayət edilir ki, ibn Əbu Əufə رضي الله عنهما demişdir: “Biz Peyğəmbərin ﷺ, Əbu Bəkrin və Ömərin dövründə (bəzən alacağımız) buğdanın, arpanın, kişmişin və xurmanın (pulunu) qabaqcadan ödəyərdik. (əl-Buxari, 2242-2243)

## ٢ – باب: السَّلَمُ إِلَى مَا لَيْسَ عِنْدَهُ أَصْلٌ

## 2-ci fəsil. Əlində bir əsası[1] olmayan (adama) qabaqcadan (pul) ödəmək

١٠٤٩ – عَنْ ابْنِ أَبِى أَوْفَى رضي الله عنهما قَالَ: كُنَّا نُسْلِفُ نَبِيطَ أَهْلِ الشَّأْمِ فِى الْحِنْطَةِ وَالشَّعِيرِ وَالزَّيْتِ فِى كَيْلٍ مَعْلُومٍ إِلَى أَجَلٍ مَعْلُومٍ. قِيلَ لَهُ: إِلَى مَنْ كَانَ أَصْلُهُ عِنْدَهُ؟ قَالَ: مَا كُنَّا نَسْأَلُهُمْ عَنْ ذَلِكَ. [رواه البخاري: ٢٢٤٤-٢٢٤٥]

**1049.** Rəvayət edilir ki, ibn Əbu Əufə رضي الله عنهما demişdir: “Biz Şam kəndlilərindən təyin olunmuş vaxta qədər müəyyən edilmiş miqdarda buğda, arpa və zeytun yağı almaq üçün (onlara) qabaqcadan pul verirdik.” Ondan soruşdular: “Əlində əsası olan kimsələrə (verirdiniz)?” O dedi: “Bu haqda biz onlardan soruşmazdıq?” (əl-Buxari, 2244-2245)

[1] Məsələn, xurma ağacına sahib olmayan bir kimsədən xurma almaq və ya özünün əkin sahəsi olmayan bir adamdan buğda, arpa və s. almaq üçün ona qabaqcadan pul ödəmək.

# ٣٧ – كِتَابُ الشُّفْعَةِ

# 37 – (Əmlakı) almaqda daha haqlı olan kimsələr[1] kitabı

## ١ – باب: عَرْضُ الشُّفْعَةِ عَلَى صَاحِبِهَا

## 1-ci fəsil. (Sahibkar öz malını satdıqda) onu daha çox haqqı olan kimsəyə təklif etməlidir

١٠٥٠ – عَنْ أَبِي رَافِعٍ مَوْلَى النَّبِيِّ ﷺ أَنَّهُ جَاءَ إِلَى سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ رضي الله عنه فَقَالَ: يَا سَعْدُ ابْتَعْ مِنِّي بَيْتَيَّ فِي دَارِكَ. فَقَالَ سَعْدٌ: وَاللَّهِ لاَ أَزِيدُكَ عَلَى أَرْبَعَةِ آلاَفٍ مُنَجَّمَةٍ أَوْ مُقَطَّعَةٍ. قَالَ أَبُو رَافِعٍ: لَقَدْ أُعْطِيتُ بِهَا خَمْسَمِائَةِ دِينَارٍ، وَلَوْلاَ أَنِّي سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «الْجَارُ أَحَقُّ بِسَقَبِهِ». مَا أَعْطَيْتُكَهَا بِأَرْبَعَةِ آلاَفٍ، وَأَنَا أُعْطَى بِهَا خَمْسَمِائَةِ دِينَارٍ، فَأَعْطَاهَا إِيَّاهُ. [رواه البخاري: ٢٢٥٨]

**1050.** Rəvayət edilir ki, Əbu Rafi ﷺ Səd ibn Əbu Vəqqasın ﷺ yanına gəlib demişdir: "Ey Səd, gəlsənə həyətyanı sahəndə yerləşən mənim iki evimi alasan." Səd dedi: "Vallahi, mən sənə hissə-hissə cəmi dörd min (dirhəm) verə bilərəm." Əbu Rafi dedi: "Buna görə mənə beş yüz dinar[2] verirlər. Əgər mən Peyğəmbərin ﷺ: "Qonşunun öz həyətyanı sahəsinə aid olan bir şeyi almağa daha çox haqqı çatır"– dediyini eşitməsəydim, buna görə mənə beş yüz dinar verildiyi halda, mən onu sənə dörd min dirhəmə verməzdim." Sonra da bu evləri ona satdı. (əl-Buxari, 2258)

## ٢ – باب: أَيُّ الْجِوَارِ أَقْرَبُ

## 2-ci fəsil. Hansı qonşu daha yaxın hesab olunur?

١٠٥١ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: قُلْتُ يَا رَسُولَ اللَّهِ، إِنَّ لِي جَارَيْنِ، فَإِلَى أَيِّهِمَا أُهْدِي قَالَ: «إِلَى أَقْرَبِهِمَا مِنْكِ بَابًا». [رواه البخاري: ٢٢٥٩]

**1051.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən dedim: "Ya Rəsulullah, mənim iki qonşum var. Onlardan hansı birinə hədiyyə verim?" Peyğəmbər ﷺ buyurdu: "Qapısı sənə ən yaxın olana.[3]" (əl-Buxari, 2259)

---

[1] Burada şəriklər və qonşular nəzərdə tutulur. 1040-cı hədisə bax.

[2] 708-ci hədisin qeydlərinə bax.

[3] Burada söhbət maddi imkanın məhdud olmasından gedir. Yəni, əgər veriləcək hədiyyə cəmi bir dənədirsə, onu yaxın qonşuya verməк lazımdır. İmkan daxilində isə yaxın qonşuların hamısına hədiyyə verməк bəyənilir.

# ٣٨ – كِتَابُ الإِجَارَةِ

# 38 – İcarə[1] kitabı

## ١– باب: فِي الإِجَارَةِ

## 1-ci fəsil. İcarə haqqında deyilənlər

١٠٥٢ – عَنْ أَبِي مُوسَى الأَشْعَرِيِّ ﷺ قَالَ: أَقْبَلْتُ إِلَى النَّبِيِّ ﷺ وَمَعِي رَجُلاَنِ مِنَ الأَشْعَرِيِّينَ، فَقُلْتُ مَا عَلِمْتُ أَنَّهُمَا يَطْلُبَانِ الْعَمَلَ. فَقَالَ: «لَنْ أَوْ لاَ نَسْتَعْمِلُ عَلَى عَمَلِنَا مَنْ أَرَادَهُ». [رواه البخاري: ٢٢٦١]

**1052.** Rəvayət edilir ki, Əbu Musa əl-Əşari ﷺ demişdir: "(Bir dəfə) mən əşarili iki nəfərlə birlikdə Peyğəmbərin ﷺ yanına gəlib dedim: "Mən bilmirdim ki, onlar iş axtarırlar?" Peyğəmbər ﷺ buyurdu: "Biz, işimizdə vəzifəyə can atan kimsələrə vəzifə vermirik.[2]" (əl-Buxari, 2261)

## ٢– باب: رَعْيُ الْغَنَمِ عَلَى قَرَارِيطَ

## 2-ci fəsil. Qirat[3] müqabilində qoyun otarmaq

١٠٥٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَا بَعَثَ اللَّهُ نَبِيًّا إِلاَّ رَعَى الْغَنَمَ». فَقَالَ أَصْحَابُهُ: وَأَنْتَ؟ فَقَالَ «نَعَمْ كُنْتُ أَرْعَاهَا عَلَى قَرَارِيطَ لأَهْلِ مَكَّةَ». [رواه البخاري: ٢٢٦٢]

**1053.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahın göndərdiyi peyğəmbərlərin hamısı qoyun otarmışlar." Əshabələr: "Sən də?"– deyə soruşdular. Dedi: "Bəli, mən bir neçə qirata məkkəlilərin qoyunlarını otarardım." (əl-Buxari, 2262)

## ٣– باب: الإِجَارَةُ مِنَ الْعَصْرِ إِلَى اللَّيْلِ

## 3-cü fəsil. Axşam çağından gecəyə qədər muzdlu işçi tutmaq

١٠٥٤ – عَنْ أَبِي مُوسَى ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَثَلُ الْمُسْلِمِينَ وَالْيَهُودِ وَالنَّصَارَى كَمَثَلِ رَجُلٍ اسْتَأْجَرَ قَوْمًا يَعْمَلُونَ لَهُ عَمَلاً يَوْمًا إِلَى اللَّيْلِ عَلَى أَجْرٍ مَعْلُومٍ، فَعَمِلُوا لَهُ إِلَى نِصْفِ النَّهَارِ فَقَالُوا لاَ حَاجَةَ لَنَا إِلَى أَجْرِكَ الَّذِى شَرَطْتَ لَنَا، وَمَا عَمِلْنَا بَاطِلٌ، فَقَالَ لَهُمْ لاَ تَفْعَلُوا أَكْمِلُوا بَقِيَّةَ عَمَلِكُمْ، وَخُذُوا أَجْرَكُمْ كَامِلاً، فَأَبَوْا وَتَرَكُوا، وَاسْتَأْجَرَ أَجِيرَيْنِ بَعْدَهُمْ فَقَالَ لَهُمَا أَكْمِلاَ بَقِيَّةَ يَوْمِكُمَا هَذَا، وَلَكُمَا الَّذِى شَرَطْتُ لَهُمْ مِنَ الأَجْرِ. فَعَمِلُوا حَتَّى إِذَا كَانَ حِينُ صَلاَةِ الْعَصْرِ قَالاَ لَكَ مَا عَمِلْنَا بَاطِلٌ، وَلَكَ الأَجْرُ الَّذِى جَعَلْتَ لَنَا فِيهِ. فَقَالَ لَهُمَا أَكْمِلاَ بَقِيَّةَ عَمَلِكُمَا، فَإِنَّ مَا بَقِيَ مِنَ النَّهَارِ شَيْءٌ يَسِيرٌ. فَأَبَيَا، وَاسْتَأْجَرَ قَوْمًا أَنْ يَعْمَلُوا لَهُ بَقِيَّةَ يَوْمِهِمْ،

---

[1] Müəyyən şərtlər əsasında daşınan və ya daşınmaz əmlakın müvəqqəti istifadəyə verilməsi və ya alınması.

[2] Burada söhbət vəzifəyə can atmaqdan gedir.

[3] 44-cü hədisə bax.

فَعَمِلُوا بَقِيَّةَ يَوْمِهِمْ حَتَّى غَابَتِ الشَّمْسُ، وَاسْتَكْمَلُوا أَجْرَ الْفَرِيقَيْنِ كِلَيْهِمَا، فَذَلِكَ مَثَلُهُمْ وَمَثَلُ مَا قَبِلُوا مِنْ هَذَا النُّورِ». [رواه البخاري: ٢٢٧١]

**1054.** Əbu Musa ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlmanların, yəhudilərin və nəsranilərin misalı, müəyyən zəhmət haqqı müqabilində səhərdən gecəyə qədər işlərini görəcək işçilər tutmuş bir nəfərin misalı kimidir. Onlar günortayadək onun üçün işlədikdən sonra dedilər: "Sənin bizə vəd etdiyin zəhmət haqqına ehtiyacımız yoxdur. Qoy etdiklərimiz də heç olsun." Adam onlara: "Belə etməyin! Qalan işinizi tamamlayın və zəhmət haqqınızı tam olaraq alın"– dedi. Onlar isə (bundan) imtina etdilər və (onu) tərk edib getdilər. Bunlardan sonra həmin adam iki işçi tutdu və onlara: "Bu günün qalan saatlarını tamamlayın, onlara vəd etdiyim zəhmət haqqı sizin olsun. Onlar əsr namazının vaxtınadək işlədikdən sonra dedilər: "Qoy etdiklərimiz puç olub getsin. Üstəlik bizə vəd etdiyin zəhmət haqqı da sənin olsun." Adam onlara: "Qalan işinizi tamamlayın. Axı günün başa çatmağına çox az qalıb"– dedi. Onlar isə imtina etdilər. Sonra həmin adam günün qalan hissəsində onun üçün işləsinlər deyə bir dəstə işçi tutdu. Onlar günün qalan hissəsini ta gün batanadək işlədilər və (özlərinin zəhmət haqqı ilə yanaşı) əvvəlki iki dəstənin[1] zəhmət haqqını da alıb getdilər. Budur onların[2] misalı və onların bu nurdan[3] qazandıqlarının misalı." (əl-Buxari, 2271)

### ٤ – باب: مَن اسْتَأْجَرَ أَجِيرًا فَتَرَكَ أَجْرَهُ، فَعَمِلَ فِيهِ الْمُسْتَأْجِرُ فَزَادَ

### 4-cü fəsil. Bir adamın işçi tutması, bu işçinin zəhmət haqqını almayıb çıxıb getməsi, sonra da həmin adamın işçinin zəhmət haqqını işə qoyub artırması haqqında

**١٠٥٥ –** عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﵄ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «انْطَلَقَ ثَلاثَةُ رَهْطٍ مِمَّنْ كَانَ قَبْلَكُمْ حَتَّى أَوَوُا الْمَبِيتَ إِلَى غَارٍ فَدَخَلُوهُ، فَانْحَدَرَتْ صَخْرَةٌ مِنَ الْجَبَلِ فَسَدَّتْ عَلَيْهِمُ الْغَارَ فَقَالُوا إِنَّهُ لاَ يُنْجِيكُمْ مِنْ هَذِهِ الصَّخْرَةِ إِلاَّ أَنْ تَدْعُوا اللَّهَ بِصَالِحِ أَعْمَالِكُمْ. فَقَالَ رَجُلٌ مِنْهُمُ اللَّهُمَّ كَانَ لِي أَبَوَانِ شَيْخَانِ كَبِيرَانِ، وَكُنْتُ لاَ أَغْبِقُ قَبْلَهُمَا أَهْلاً وَلاَ مَالاً، فَنَأَى بِي فِي طَلَبِ شَيْءٍ يَوْمًا، فَلَمْ أُرِحْ عَلَيْهِمَا حَتَّى نَامَا، فَحَلَبْتُ لَهُمَا غَبُوقَهُمَا فَوَجَدْتُهُمَا نَائِمَيْنِ وَكَرِهْتُ أَنْ أَغْبِقَ قَبْلَهُمَا أَهْلاً أَوْ مَالاً، فَلَبِثْتُ وَالْقَدَحُ عَلَى يَدَيَّ أَنْتَظِرُ اسْتِيقَاظَهُمَا حَتَّى بَرَقَ الْفَجْرُ، فَاسْتَيْقَظَا فَشَرِبَا غَبُوقَهُمَا، اللَّهُمَّ إِنْ كُنْتُ فَعَلْتُ ذَلِكَ ابْتِغَاءَ وَجْهِكَ فَفَرِّجْ عَنَّا مَا نَحْنُ فِيهِ مِنْ هَذِهِ الصَّخْرَةِ، فَانْفَرَجَتْ شَيْئًا لاَ يَسْتَطِيعُونَ الْخُرُوجَ». قَالَ النَّبِيُّ ﷺ: «وَقَالَ الآخَرُ اللَّهُمَّ كَانَتْ لِي بِنْتُ عَمٍّ كَانَتْ أَحَبَّ النَّاسِ إِلَيَّ، فَأَرَدْتُهَا عَنْ نَفْسِهَا، فَامْتَنَعَتْ مِنِّي حَتَّى أَلَمَّتْ بِهَا سَنَةٌ مِنَ السِّنِينَ، فَجَاءَتْنِي فَأَعْطَيْتُهَا عِشْرِينَ وَمِائَةَ دِينَارٍ عَلَى أَنْ تُخَلِّيَ بَيْنِي وَبَيْنَ نَفْسِهَا، فَفَعَلَتْ حَتَّى إِذَا قَدَرْتُ

[1] Söhbət yəhudilərdən və nəsranilərdən gedir.
[2] Söhbət müsəlmanlardan gedir.
[3] Burada nur deyildikdə Quran və Sünnə nəzərdə tutulur.

عَلَيْهَا قَالَتْ لاَ أُحِلُّ لَكَ أَنْ تَفُضَّ الْخَاتَمَ إِلاَّ بِحَقِّهِ. فَتَحَرَّجْتُ مِنَ الْوُقُوعِ عَلَيْهَا، فَانْصَرَفْتُ عَنْهَا وَهِىَ أَحَبُّ النَّاسِ إِلَىَّ وَتَرَكْتُ الذَّهَبَ الَّذِى أَعْطَيْتُهَا، اللَّهُمَّ إِنْ كُنْتُ فَعَلْتُ ذَلِكَ ابْتِغَاءَ وَجْهِكَ فَافْرُجْ عَنَّا مَا نَحْنُ فِيهِ. فَانْفَرَجَتِ الصَّخْرَةُ، غَيْرَ أَنَّهُمْ لاَ يَسْتَطِيعُونَ الْخُرُوجَ مِنْهَا. قَالَ النَّبِىُّ ﷺ: وَقَالَ الثَّالِثُ اللَّهُمَّ إِنِّى اسْتَأْجَرْتُ أُجَرَاءَ فَأَعْطَيْتُهُمْ أَجْرَهُمْ، غَيْرَ رَجُلٍ وَاحِدٍ تَرَكَ الَّذِى لَهُ وَذَهَبَ فَثَمَّرْتُ أَجْرَهُ حَتَّى كَثُرَتْ مِنْهُ الأَمْوَالُ، فَجَاءَنِى بَعْدَ حِينٍ فَقَالَ يَا عَبْدَ اللَّهِ أَدِّ إِلَىَّ أَجْرِى. فَقُلْتُ لَهُ كُلُّ مَا تَرَى مِنْ أَجْرِكَ مِنَ الإِبِلِ وَالْبَقَرِ وَالْغَنَمِ وَالرَّقِيقِ. فَقَالَ يَا عَبْدَ اللَّهِ لاَ تَسْتَهْزِئْ بِى. فَقُلْتُ إِنِّى لاَ أَسْتَهْزِئُ بِكَ. فَأَخَذَهُ كُلَّهُ فَاسْتَاقَهُ فَلَمْ يَتْرُكْ مِنْهُ شَيْئًا، اللَّهُمَّ فَإِنْ كُنْتُ فَعَلْتُ ذَلِكَ ابْتِغَاءَ وَجْهِكَ فَافْرُجْ عَنَّا مَا نَحْنُ فِيهِ. فَانْفَرَجَتِ الصَّخْرَةُ فَخَرَجُوا يَمْشُونَ». [رواه البخاري: ٢٢٧٢]

**1055.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Sizdən əvvəl yaşamış ümmətlərdən üç nəfər səfərə çıxdı və (yolda) gecələmək üçün bir mağaraya çəkildilər. Onlar mağaraya daxil olduqdan sonra dağdan böyük bir qaya parçası yuvarlanıb yerə düşdü və mağaranın ağzını qapadı. Onlar (bir-birlərinə) dedilər: "Sizi bu qaya parçasından ancaq etdiyiniz yaxşı əməllərinizin[1] vasitəsilə Allaha dua etməyiniz qurtara bilər.

Onlardan birisi dedi: "Ey Allahım! Mənim qoca ata-anam var idi. Mən hər axşam onlara süd içirtməmiş nə ailəmə, nə də xidmətçilərimə süd verərdim. Bir gün mən bir iş dalınca çox uzağa getdim, evə qayıtdıqda ata-anam artıq yatmışdı; mən onlar üçün süd sağıb gətirdım, lakin (gəlib) onları yatmış gördüm. Mən onlara süd içirtməmiş ailəmə və xidmətçilərimə süd vermək istəmədim. Odur ki, sübh açılanadək əlimdə (süd dolu) bardaq onların yuxudan oyanmasını gözlədim. (Nəhayət,) onlar yuxudan oyanıb südlərini içdilər. Allahım, əgər mən bunu Sənin Üzünü dilədiyimə görə etmişəmsə, bizi bu qaya parçasına görə düşdüyümüz (çətinlikdən) qurtar!" Bundan sonra (mağaranın keçidi) bir balaca açıldı, lakin onlar (bayıra) çıxa bilmədilər."

Peyğəmbər ﷺ buyurdu: "Digəri dedi: "Ey Allahım! Mənim hamıdan çox sevdiyim bir əmim qızı var idi. Mən onun könlünü ələ almaq istədim, lakin o mənə könül vermədi. Aradan illər keçdi. Nəhayət, (quraqlıq ilində) o mənim yanıma gəldi və mən ona mənimlə yaxınlıq etmək şərtilə yüz iyirmi dinar verdim. O da buna razılıq verdi. Mən onu ağuşuma aldıqda o dedi: "Nikaha girmədən bakirəliyimi pozmağa sənə halallıq vermirəm." Mən onu ələ almaqla günah qazanacağımdan qorxdum, onu buraxıb getdim, ona verdiyim qızılı da ona bağışladım. Halbuki o mənim üçün ən əziz insan idi. Allahım, əgər mən bunu Sənin Üzünü dilədiyimə görə etmişəmsə, bizi bu düşdüyümüz (çətinlikdən) qurtar!" Bundan sonra qaya parçası yerindən tərpəndi, lakin onlar mağaradan çıxa bilmədilər."

Peyğəmbər ﷺ buyurdu: "Üçüncüsü dedi: "Ey Allahım! (Bir dəfə) mən bir dəstə işçi tutdum və onların hamısının zəhmət haqqını verdim. Yalnız biri öz zəhmət haqqını almadan çıxıb getdi. Mən onun zəhmət haqqını işə qoydum və onun malları artdı. Xeyli vaxt keçdikdən sonra həmin adam gəlib dedi: "Ey Allahın qulu, mənim zəhmət haqqımı ver!" Mən ona dedim: "Gör-

[1] Söhbət müsəlmanın Allah rizasını qazanmaq üçün etdiyi əməldən gedir.

düyün bu dəvələr, inəklər, qoyunlar və kölələr sənin zəhmət haqqındır." O dedi: "Ey Allahın qulu, mənə istehza etmə!" Mən dedim: "Mən sənə istehza etmirəm." Bundan sonra adam malların hamısını sürüb apardı və onlardan heç bir şey saxlamadı. Allahım, əgər mən bunu Sənin Üzünü dilədiyimə görə etmişəmsə, bizi bu düşdüyümüz (çətinlikdən) qurtar!" Beləliklə, qaya parçası tamamilə aralandı və onlar oradan çıxıb getdilər." (əl-Buxari, 2272)

## 5-ci fəsil. Ruqya[1] müqabilində verilən (zəhmət haqqı)

## ٥– باب: مَا يُعْطَى فِى الرُّقْيَةِ

١٠٥٦ – عَنْ أَبِى سَعِيد ﷺ قَالَ: انْطَلَقَ نَفَرٌ مِنْ أَصْحَابِ النَّبِىِّ ﷺ فِى سَفْرَةٍ سَافَرُوهَا حَتَّى نَزَلُوا عَلَى حَىٍّ مِنْ أَحْيَاءِ الْعَرَبِ فَاسْتَضَافُوهُمْ، فَأَبَوْا أَنْ يُضَيِّفُوهُمْ، فَلُدِغَ سَيِّدُ ذَلِكَ الْحَىِّ، فَسَعَوْا لَهُ بِكُلِّ شَىْءٍ لاَ يَنْفَعُهُ شَىْءٌ، فَقَالَ بَعْضُهُمْ لَوْ أَتَيْتُمْ هَؤُلاَءِ الرَّهْطَ الَّذِينَ نَزَلُوا لَعَلَّهُ أَنْ يَكُونَ عِنْدَ بَعْضِهِمْ شَىْءٌ، فَأَتَوْهُمْ ، فَقَالُوا يَا أَيُّهَا الرَّهْطُ، إِنَّ سَيِّدَنَا لُدِغَ، وَسَعَيْنَا لَهُ بِكُلِّ شَىْءٍ لاَ يَنْفَعُهُ، فَهَلْ عِنْدَ أَحَدٍ مِنْكُمْ مِنْ شَىْءٍ فَقَالَ بَعْضُهُمْ نَعَمْ وَاللَّهِ إِنِّى لأَرْقِى، وَلَكِنْ وَاللَّهِ لَقَدِ اسْتَضَفْنَاكُمْ فَلَمْ تُضَيِّفُونَا، فَمَا أَنَا بِرَاقٍ لَكُمْ حَتَّى تَجْعَلُوا لَنَا جُعْلاً. فَصَالَحُوهُمْ عَلَى قَطِيعٍ مِنَ الْغَنَمِ، فَانْطَلَقَ يَتْفِلُ عَلَيْهِ وَيَقْرَأُ ( الْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ ) فَكَأَنَّمَا نُشِطَ مِنْ عِقَالٍ، فَانْطَلَقَ يَمْشِى وَمَا بِهِ قَلَبَةٌ، قَالَ فَأَوْفَوْهُمْ جُعْلَهُمُ الَّذِى صَالَحُوهُمْ عَلَيْهِ، فَقَالَ بَعْضُهُمُ اقْسِمُوا. فَقَالَ الَّذِى رَقَى لاَ تَفْعَلُوا، حَتَّى نَأْتِىَ النَّبِىَّ ﷺ فَنَذْكُرَ لَهُ الَّذِى كَانَ، فَنَنْظُرَ مَا يَأْمُرُنَا. فَقَدِمُوا عَلَى رَسُولِ اللَّهِ ﷺ فَذَكَرُوا لَهُ، فَقَالَ: «وَمَا يُدْرِيكَ أَنَّهَا رُقْيَةٌ – ثُمَّ قَالَ – قَدْ أَصَبْتُمُ اقْسِمُوا وَاضْرِبُوا لِى مَعَكُمْ سَهْمًا». فَضَحِكَ رَسُولُ اللَّهِ ﷺ. [رواه البخاري: ٢٢٧٦]

**1056.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbərin ﷺ əshabələrindən bir dəstə səfərə yola düşdü. Nəhayət, onlar gəlib bədəvi qəbilələrindən birinə məxsus bir kənddə dayandılar. Əshabələr onların evində qonaq olmaq istədilər, lakin onlar əshabələri (yeməyə) qonaq etmək istəmədilər. Bu əsnada qəbilə başçısını (əqrəb) sancdı. Kənddəkilər ona əllərindən gələn köməyi göstərməyə çalışdılar, lakin bu cəhdlərin heç bir faydası olmadı. Onlardan bəzisi dedi: "Yaxşı olar ki, gedib (kəndimizə) təşrif buyurmuş adamlara müraciət edəsiniz, bəlkə onlarda nə isə tapıla." Onlar əshabələrin yanına gəlib dedilər: "Ay camaat! Qəbilə başçımızı (əqrəb) sancmışdır. Nə qədər çalışdıqsa, əlac tapa bilmədik. Bəlkə sizdən birinizdə bir şey tapıla?" Əshabələrdən birisi dedi: "Bəli, vallahi ki, mən ruqya oxuya bilirəm. Vallahi, biz sizin qonağınız olmaq istədik, lakin siz bizi (yeməyə) qonaq etmədiniz. Elə buna görə də bizə zəhmət haqqı verməyincə, mən sizin (xəstəniz) üçün ruqya oxumayacağam." Sonra onlar (müalicə müqabilində) əshabələrə bir sürü qoyun verəcəklərinə razılaşdılar. Bundan sonra o, (qəbilə başçısının yanına gəlib onun yarasına) yüngülcə tüpürdü və "əl-Fatihə" surəsini oxudu.

---

[1] Hərfi tərcümədə ovsun deməkdir. Lakin burada ovsun deyildikdə sehr, cadu, pitik deyil, əksinə, mübarək sözlərlə – Allahın Kəlamı və ya Peyğəmbərin ﷺ duaları vasitəsilə xəstəni müalicə etmək nəzərdə tutulur.

(Bir az keçdikdən) sonra qəbilə başçısı sanki buxovdan azad oldu və xəstə deyilmiş kimi ayağa qalxıb gəzməyə başladı. Onlar əshabələrə razılaşdıqları zəhmət haqqını verdilər. Bu vaxt əshabələrdən biri: "(Qoyunları) bölüşdürün!"– dedi. Ruqya oxuyan əshabə isə: "Peyğəmbərin ﷺ yanına gedib hadisəni ona danışmayınca və onun nə hökm verəcəyini öyrənməyincə, heç (bir şey) etməyin!"– deyə etiraz etdi. Onlar Peyğəmbərin ﷺ yanına gəlib hadisəni ona danışdıqda o soruşdu: "Sən nə bilirdin ki, bu[1], ruqyadır?" Sonra əlavə edib dedi: "Siz düz etmisiniz. (Qoyunları) bölüşdürün və özünüzlə yanaşı mənim üçün də bir pay ayırın." (Bunu deyəndən) sonra Peyğəmbər ﷺ gülümsədi." (əl-Buxari, 2276)

## 6-cı fəsil. Erkək heyvanın toxumu[2]

## ٦– باب: عَسْبُ الْفَحْلِ

١٠٥٧ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: نَهَى النَّبِيُّ ﷺ عَنْ عَسْبِ الْفَحْلِ. [رواه البخاري: ٢٢٨٤]

**1057.** Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ erkək heyvanın toxumunu (satmağı və ya onun dişi heyvanla çütləşməsinə görə pul almağı) qadağan etmişdir." (əl-Buxari, 2284)

[1] Burada "əl-Fatihə" surəsi qəsd edilir.
[2] Erkək heyvanın tənasül vəzilərinin hasil etdiyi maye.

# ٣٩ – كِتَابُ الحَوَالاتِ

# 39 – Həvalə[1] kitabı

## ١ – باب: إِذَا أَحَالَ عَلَى مَلِيٍّ فَلَيْسَ لَهُ رَدٌّ

## 1-ci fəsil. Əgər (borc) varlı bir adama həvalə edilərsə, buna etiraz etmək olmaz

١٠٥٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَطْلُ الْغَنِيِّ ظُلْمٌ، وَمَنْ أُتْبِعَ عَلَى مَلِيٍّ فَلْيَتَّبِعْ». [رواه البخاري: ٢٢٨٨]

**1058.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İmkanlı adamın (ödəyəcəyi borcu) gecikdirməsi zülmdür. (Odur ki,) əgər birinizin borcu varlı adama həvalə edilərsə, qoy buna razılıq versin." (əl-Buxari, 2288)

## ٢ – باب: إِنْ أَحَالَ دَيْنَ الْمَيِّتِ عَلَى رَجُلٍ جَازَ

## 2-ci fəsil. Ölən adamın borcunu başqa bir adama həvalə etmək caizdir

١٠٥٩ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ قَالَ كُنَّا جُلُوسًا عِنْدَ النَّبِيِّ ﷺ إِذْ أُتِيَ بِجَنَازَةٍ، فَقَالُوا صَلِّ عَلَيْهَا. فَقَالَ: «هَلْ عَلَيْهِ دَيْنٌ». قَالُوا لاَ. قَالَ: «فَهَلْ تَرَكَ شَيْئًا». قَالُوا لاَ. فَصَلَّى عَلَيْهِ ثُمَّ أُتِيَ بِجَنَازَةٍ أُخْرَى، فَقَالُوا يَا رَسُولَ اللَّهِ، صَلِّ عَلَيْهَا. قَالَ: «هَلْ عَلَيْهِ دَيْنٌ». قِيلَ نَعَمْ. قَالَ: «فَهَلْ تَرَكَ شَيْئًا». قَالُوا ثَلاَثَةَ دَنَانِيرَ. فَصَلَّى عَلَيْهَا، ثُمَّ أُتِيَ بِالثَّالِثَةِ، فَقَالُوا صَلِّ عَلَيْهَا. قَالَ: «هَلْ تَرَكَ شَيْئًا». قَالُوا لاَ. قَالَ: «فَهَلْ عَلَيْهِ دَيْنٌ». قَالُوا ثَلاَثَةُ دَنَانِيرَ. قَالَ: «صَلُّوا عَلَى صَاحِبِكُمْ». قَالَ أَبُو قَتَادَةَ صَلِّ عَلَيْهِ يَا رَسُولَ اللَّهِ، وَعَلَيَّ دَيْنُهُ. فَصَلَّى عَلَيْهِ. [رواه البخاري: ٢٢٨٩]

**1059.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ﷺ demişdir: "(Bir dəfə) biz Peyğəmbərin ﷺ yanında oturmuşduq. Bu vaxt bir cənazə gətirdilər və (Peyğəmbərə ﷺ): "Buna (cənazə) namazı qıl!"– dedilər. Peyğəmbər ﷺ: "Onun borcu varmı?"– deyə soruşdu. Onlar: "Xeyr!"– deyə cavab verdilər. O: "(Özündən sonra) bir şey qoyub gedibmi?"– deyə soruşdu. Onlar: "Xeyr!"– deyə cavab verdilər. Belə olduqda Peyğəmbər ﷺ ona namaz qıldı. Sonra başqa bir cənazə gətirdilər və (Peyğəmbərə ﷺ): "Ya Rəsulullah, buna namaz qıl!"– dedilər. Peyğəmbər ﷺ: "Onun borcu varmı?"– deyə soruşdu. Onlar: "Bəli!"– deyə cavab verdilər. O: "(Özündən sonra) bir şey qoyub gedibmi?"– deyə soruşdu. Onlar: "Üç dinar!"– deyə cavab verdilər. Belə olduqda Peyğəmbər ﷺ onun üçün də namaz qıldı. Daha sonra üçüncü bir cənazəni gətirdilər və (Peyğəmbərə ﷺ): "Buna namaz qıl!"– dedilər. Peyğəmbər ﷺ: "(Özündən sonra) bir şey qoyub gedibmi?"– deyə soruşdu. Onlar: "Xeyr!"– deyə cavab verdilər. O: "Borcu varmı?"– deyə soruşdu. Onlar: "Üç dinar!"– deyə cavab verdilər. Belə olduqda (Peyğəmbər ﷺ özü ona namaz qılmadı, lakin əshabələrinə): "Yoldaşınıza namaz qılın!"– deyə buyurdu.

Əbu Qətadə: "Ya Rəsulullah, sən ona (cənazə) namazı qıl, mən onun borcunu öz öhdəmə götürürəm"– dedi və Peyğəmbər ﷺ ona cənazə namazı qıldı." (əl-Buxari, 2289)

[1] Bir ödənişin başqa şəxsin adına keçirilməsi.

# ٤٠ – كِتَابُ الكَفَالَةِ

# 40 – Zaminlik[1] kitabı

## ١ – باب: مَا جَاءَ فِى قَوْلِ اللَّهِ تَعَالَى: ﴿وَٱلَّذِينَ عَقَدَتْ أَيْمَٰنُكُمْ فَـَٔاتُوهُمْ نَصِيبَهُمْ﴾

## 1-ci fəsil. Uca Allahın: "...əhd bağladığınız kəslərin paylarını *özlərinə* verin..."[2] sözü

١٠٦٠ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّهُ قِيلَ لَهُ: أَبَلَغَكَ أَنَّ النَّبِىَّ ﷺ قَالَ: «لاَ حِلْفَ فِى الإِسْلاَمِ». فَقَالَ قَدْ حَالَفَ النَّبِىُّ ﷺ بَيْنَ قُرَيْشٍ وَالأَنْصَارِ فِى دَارِى. [رواه البخاري: ٢٢٩٤]

**1060.** Rəvayət edilir ki, Ənəs ibn Malikdən ﷺ soruşdular: "Sən Peyğəmbərin ﷺ: "İslamda (qəbilələr arasında bağlanan) ittifaq yoxdur"– dediyini eşitmisənmi?" Ənəs dedi: "Peyğəmbər ﷺ mənim evimdə qureyşlilərlə ənsar arasında ittifaq bağlamışdır.[3]" (əl-Buxari, 2294)

## ٢ – باب: مَنْ تَكَفَّلَ عَنْ مَيِّتٍ دَيْنًا فَلَيْسَ لَهُ أَنْ يَرْجِعَ

## 2-ci fəsil. Ölən adamın borcunu öz boynuna götürən adamın sözündən vaz keçməyə haqqı yoxdur

١٠٦١ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «لَوْ قَدْ جَاءَ مَالُ الْبَحْرَيْنِ، قَدْ أَعْطَيْتُكَ هَكَذَا وَهَكَذَا وَهَكَذَا». فَلَمْ يَجِئْ مَالُ الْبَحْرَيْنِ حَتَّى قُبِضَ النَّبِىُّ ﷺ فَلَمَّا جَاءَ مَالُ الْبَحْرَيْنِ أَمَرَ أَبُو بَكْرٍ فَنَادَى مَنْ كَانَ لَهُ عِنْدَ النَّبِىِّ ﷺ عِدَةٌ أَوْ دَيْنٌ فَلْيَأْتِنَا. فَأَتَيْتُهُ، فَقُلْتُ إِنَّ النَّبِىَّ ﷺ قَالَ لِى كَذَا وَكَذَا، فَحَثَى لِى حَثْيَةً فَعَدَدْتُهَا فَإِذَا هِىَ خَمْسُمِائَةٍ، وَقَالَ خُذْ مِثْلَيْهَا. [رواه البخاري: ٢٢٩٦]

**1061.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ (mənə) dedi: "Bəhreyndən mallar gəlsə, sənə filan şey, filan şey və filan şey verəcəyəm." Peyğəmbər ﷺ vəfat edənədək Bəhreyndən mal gəlmədi. (Nəhayət,) Bəhreyndən mallar gəldiyi zaman Əbu Bəkr əmr etdi ki, belə elan edilsin: "Peyğəmbər ﷺ kimə vədə vermişdirsə, yaxud kimə borclu qalmışdırsa, qoy həmin adam bizim yanımıza gəlsin!" (Bunu eşidəndə) mən Əbu Bəkrin yanına gəlib dedim: "Peyğəmbər ﷺ mənə filan və filan şeyi söz vermişdir." Əbu Bəkr ovuclayıb mənə bir qədər qızıl verdi. Mən qızılları saydım və baxdım ki, onların sayı beş yüz ədəddir. Onda Əbu Bəkr (mənə): "İki o qədərini də götür!"– deyə buyurdu. (əl-Buxari, 2296)

---

[1] Zamin olma, məsuliyyəti öhdəsinə götürmə.

[2] "ən-Nisa" surəsi, 33.

[3] Burada söhbət müşrik qəbilələrin öz məkrli məqsədlərini həyata keçirmək məqsədilə aralarında bağladıqları ittifaqdan yox, əksinə, Allahın rizasını qazanmaq məqsədilə mühacirlərlə ənsarın arasında olan qardaşlıq ittifaqından gedir.

# ٤١ – كِتَابُ الوَكَالَةِ

# 41 – Vəkalət[1] kitabı

## ١– باب: وَكَالَةُ الشَّرِيكِ

## 1-ci fəsil. Şərikə vəkalət vermək

١٠٦٢ – عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ أَعْطَاهُ غَنَمًا يَقْسِمُهَا عَلَى صَحَابَتِهِ، فَبَقِيَ عَتُودٌ فَذَكَرَهُ لِلنَّبِيِّ ﷺ فَقَالَ: «ضَحِّ بِهِ أَنْتَ». [رواه البخاري: ٢٣٠٠]

**1062.** Uqbə ibn Amir ﷺ rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ ona (bir sürü) qoyun verdi ki, onları əshabələrin arasında bölüşdürsün. (Uqbə qoyunları bölüşdürdükdən) sonra bir çəpiş qaldı və o, bu haqda Peyğəmbərə ﷺ xəbər verdikdə o dedi: "Onu da özün üçün kəs!" (əl-Buxari, 2300)

## ٢– باب: إِذَا أَبْصَرَ الرَّاعِي أَوِ الْوَكِيلُ شَاةً تَمُوتُ أَوْ شَيْئًا يَفْسُدُ ذَبَحَ وَأَصْلَحَ مَا يَخَافُ عَلَيْهِ الْفَسَادَ

## 2-ci fəsil. Çoban can verən bir qoyun gördüyü zaman onu kəsə bilər, vəkil də xarab olacaq bir mal gördüyü zaman onu xilas edə bilər

١٠٦٣ – عَنْ كَعْبِ بْنِ مَالِكٍ ﷺ، أَنَّهُ كَانَتْ لَهُمْ غَنَمٌ تَرْعَى بِسَلْعٍ، فَأَبْصَرَتْ جَارِيَةٌ لَنَا بِشَاةٍ مِنْ غَنَمِنَا مَوْتًا، فَكَسَرَتْ حَجَرًا فَذَبَحَتْهَا بِهِ، فَقَالَ لَهُمْ لاَ تَأْكُلُوا حَتَّى أَسْأَلَ النَّبِيَّ ﷺ، أَوْ أُرْسِلَ إِلَى النَّبِيِّ ﷺ مَنْ يَسْأَلُهُ. وَأَنَّهُ سَأَلَ النَّبِيَّ ﷺ عَنْ ذَاكَ، أَوْ أَرْسَلَ، فَأَمَرَهُ بِأَكْلِهَا. [رواه البخاري: ٢٣٠٤]

**1063.** Rəvayət edilir ki, Kəb ibn Malik ﷺ demişdir: "Bizim, Səl dağında otlayan qoyun sürümüz var idi. (Bir dəfə) kənizimiz, qoyunlarımızdan birinin can verdiyini gördü və (yerdən) bir daş (götürüb onu) sındırdı və (sınmış) daş parçası ilə qoyunu kəsdi. Belə olduqda Kəb oradakılara: "Mən (bu xüsusda) Peyğəmbərdən ﷺ soruşanadək və ya soruşmaq üçün bir nəfəri onun yanına göndərənədək (bu qoyunu) yeməyin"– dedi. Sonra Kəb Peyğəmbərdən ﷺ bu haqda soruşdu, yaxud onun yanına adam göndərdi və o, qoyunu yeməyi əmr etdi. (əl-Buxari, 2304)

## ٣– باب: الْوَكَالَةُ فِي قَضَاءِ الدُّيُونِ

## 3-cü fəsil. Borcların ödənilməsinə dair vəkalət vermək

١٠٦٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَجُلاً أَتَى النَّبِيَّ ﷺ يَتَقَاضَاهُ، فَأَغْلَظَ، فَهَمَّ بِهِ أَصْحَابُهُ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «دَعُوهُ فَإِنَّ لِصَاحِبِ الْحَقِّ مَقَالاً». ثُمَّ قَالَ: «أَعْطُوهُ سِنًّا مِثْلَ سِنِّهِ». قَالُوا يَا رَسُولَ اللَّهِ لاَ نَجِدُ إِلاَّ أَمْثَلَ مِنْ سِنِّهِ، فَقَالَ: «أَعْطُوهُ فَإِنَّ مِنْ خَيْرِكُمْ أَحْسَنَكُمْ قَضَاءً». [رواه البخاري: ٢٣٠٦]

[1] Bir ödənişin başqa şəxsin adına keçirilməsi.

**1064.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib ondan borcunu tələb etməyə başladı və onunla kobud danışdı. Peyğəmbərin ﷺ əshabələri ona qulaqburması vermək istədikdə Peyğəmbər ﷺ buyurdu: "Ona dəyməyin! Həqiqətən, borc yiyəsinin danışmağa haqqı var." Sonra əlavə edib dedi: "Ona dəvəsi yaşında olan bir dəvə verin!" Əshabələr dedilər: "Ya Rəsulullah, bizdə olan dəvə onun dəvəsindən yaşlıdır." Peyğəmbər ﷺ buyurdu: "(Bunu) ona verin! Həqiqətən, sizin ən xeyirliniz, (borcunu) ən gözəl şəkildə ödəyəninizdir." (əl-Buxari, 2306)

## ٤ – باب: إِذَا وَهَبَ شَيْئًا لِوَكِيلٍ أَوْ شَفِيعِ قَوْمٍ جَازَ

## 4-cü fəsil. Bir tayfanın vəkilinə, yaxud havadarına hədiyyə vermək caizdir

١٠٦٥ – عَنْ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ رضي الله عنهما، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَامَ حِينَ جَاءَهُ وَفْدُ هَوَازِنَ مُسْلِمِينَ، فَسَأَلُوهُ أَنْ يَرُدَّ إِلَيْهِمْ أَمْوَالَهُمْ وَسَبْيَهُمْ فَقَالَ لَهُمْ رَسُولُ اللَّهِ ﷺ: «أَحَبُّ الْحَدِيثِ إِلَيَّ أَصْدَقُهُ. فَاخْتَارُوا إِحْدَى الطَّائِفَتَيْنِ إِمَّا السَّبْيَ، وَإِمَّا الْمَالَ، وَقَدْ كُنْتُ اسْتَأْنَيْتُ بِهِمْ». وَقَدْ كَانَ رَسُولُ اللَّهِ ﷺ انْتَظَرَهُمْ بِضْعَ عَشْرَةَ لَيْلَةً، حِينَ قَفَلَ مِنَ الطَّائِفِ، فَلَمَّا تَبَيَّنَ لَهُمْ أَنَّ رَسُولَ اللَّهِ ﷺ غَيْرُ رَادٍّ إِلَيْهِمْ إِلاَّ إِحْدَى الطَّائِفَتَيْنِ قَالُوا فَإِنَّا نَخْتَارُ سَبْيَنَا. فَقَامَ رَسُولُ اللَّهِ ﷺ فِى الْمُسْلِمِينَ، فَأَثْنَى عَلَى اللَّهِ بِمَا هُوَ أَهْلُهُ ثُمَّ قَالَ: «أَمَّا بَعْدُ فَإِنَّ إِخْوَانَكُمْ هَؤُلاَءِ قَدْ جَاءُونَا تَائِبِينَ، وَإِنِّى قَدْ رَأَيْتُ أَنْ أَرُدَّ إِلَيْهِمْ سَبْيَهُمْ، فَمَنْ أَحَبَّ مِنْكُمْ أَنْ يُطَيِّبَ بِذَلِكَ فَلْيَفْعَلْ، وَمَنْ أَحَبَّ مِنْكُمْ أَنْ يَكُونَ عَلَى حَظِّهِ حَتَّى نُعْطِيَهُ إِيَّاهُ مِنْ أَوَّلِ مَا يُفِيءُ اللَّهُ عَلَيْنَا فَلْيَفْعَلْ». فَقَالَ النَّاسُ قَدْ طَيَّبْنَا ذَلِكَ لِرَسُولِ اللَّهِ ﷺ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّا لاَ نَدْرِى مَنْ أَذِنَ مِنْكُمْ فِى ذَلِكَ مِمَّنْ لَمْ يَأْذَنْ، فَارْجِعُوا حَتَّى يَرْفَعُوا إِلَيْنَا عُرَفَاؤُكُمْ أَمْرَكُمْ». فَرَجَعَ النَّاسُ فَكَلَّمَهُمْ عُرَفَاؤُهُمْ، ثُمَّ رَجَعُوا إِلَى رَسُولِ اللَّهِ ﷺ فَأَخْبَرُوهُ أَنَّهُمْ قَدْ طَيَّبُوا وَأَذِنُوا. [رواه البخاري: ٢٣٠٧–٢٣٠٨]

**1065.** Rəvayət edilir ki, Misvər ibn Məxrəmə ﷺ demişdir: "Həvazin qövmünün müsəlman nümayəndələri Peyğəmbərin ﷺ yanına gəlib ondan mallarını və əsirlərini geri qaytarmağı xahiş etdikdə, Peyğəmbər ﷺ ayağa qalxdı və onlara buyurdu: "Mənim ən çox sevdiyim söz, ən doğru olanıdır. İkisindən birini seçin: ya əsirlər, ya da mallar. Onsuz da mən onları (paylaşdırmağı) sonraya saxlamışdım." Peyğəmbər ﷺ Taifdən qayıtdıqdan sonra onları (yerbəyer etməyib) on gündən çox gözləmişdi. Bu adamlara Peyğəmbərin ﷺ ikisindən ancaq birini qaytaracağı aydın olduqda onlar: "Biz əsirlərimizi seçirik"- dedilər. Onda Peyğəmbər ﷺ müsəlmanların arasında ayağa qalxıb Allaha – Ona layiq tərzdə təriflər dedikdən sonra buyurdu: "Sonra isə... Sizin bu qardaşlarınız, həqiqətən də, tövbə edərək bizim yanımıza gəlmişlər. Mən onların əsirlərini geri qaytarmağı lazım bildim. Odur ki, kim könül xoşluğu ilə fidyə almadan öz payına düşən əsiri qaytarmaq istəyirsə, qoy qaytarsın. Kim də özünə çatacaq payı saxlamaq istəyirsə, Allahın bizə nəsib edəcəyi ilk qənimət malından ona pay ayırmaq şərtilə sahib olduğu əsirləri qaytarsın." Əshabələr dedilər: "Peyğəmbərin ﷺ xətrinə bunu könül xoşluğu ilə yerinə yetirərik." Peyğəmbər ﷺ buyurdu: "Biz hansınızın buna razı olduğunu, hansınızın da razı olmadığını bilmirik. Gedin, qoy qərarınızı böyükləriniz bizə

bildirsinlər." Əshabələr gedib öz böyükləri ilə danışdıqdan sonra Peyğəmbərin ﷺ yanına qayıdıb onların buna könül xoşluğu ilə razılıq verdiklərini bildirdilər." (əl-Buxari, 2307-2308)

## ٥ – باب: إِذَا وَكَّلَ رَجُلاً، فَتَرَكَ الْوَكِيلُ شَيْئًا، فَأَجَازَهُ الْمُوَكِّلُ، فَهُوَ جَائِزٌ، وَإِنْ أَقْرَضَهُ إِلَى أَجَلٍ مُسَمًّى جَازَ

## 5-ci fəsil. Əgər bir adam kiməsə vəkalət vermişdirsə, müvəkkilin[1] onun razılığı ilə özünə nə isə götürməsi caizdir; habelə vəkilin ona müəyyən vaxtadək borc verməsi də caizdir

١٠٦٦ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ وَكَّلَنِى رَسُولُ اللَّه ﷺ بحفْظ زَكَاة رَمَضَانَ، فَأَتَانِى آت فَجَعَلَ يَحْثُو منَ الطَّعَام، فَأَخَذْتُهُ، وَقُلْتُ وَاللَّه لأَرْفَعَنَّكَ إِلَى رَسُول اللَّه ﷺ. قَالَ إِنِّى مُحْتَاجٌ، وَعَلَيَّ عيَالٌ، وَلى حَاجَةٌ شَديدَةٌ. قَالَ فَخَلَّيْتُ عَنْهُ فَأَصْبَحْتُ فَقَالَ النَّبِىُّ ﷺ: «يَا أَبَا هُرَيْرَةَ مَا فَعَلَ أَسيرُكَ الْبَارحَةَ». قَالَ قُلْتُ يَا رَسُولَ اللَّه شَكَا حَاجَةً شَديدَةً وَعيَالاً فَرَحمْتُهُ، فَخَلَّيْتُ سَبيلَهُ. قَالَ: «أَمَا إِنَّهُ قَدْ كَذَبَكَ وَسَيَعُودُ». فَعَرَفْتُ أَنَّهُ سَيَعُودُ لقَوْل رَسُول اللَّه ﷺ إِنَّهُ سَيَعُودُ. فَرَصَدْتُهُ فَجَاءَ يَحْثُو منَ الطَّعَام فَأَخَذْتُهُ فَقُلْتُ لأَرْفَعَنَّكَ إِلَى رَسُول اللَّه ﷺ. قَالَ دَعْنى فَإِنِّى مُحْتَاجٌ، وَعَلَيَّ عيَالٌ لاَ أَعُودُ، فَرَحمْتُهُ، فَخَلَّيْتُ سَبيلَهُ فَأَصْبَحْتُ، فَقَالَ لى رَسُولُ اللَّه ﷺ: «يَا أَبَا هُرَيْرَةَ، مَا فَعَلَ أَسيرُكَ». قُلْتُ يَا رَسُولَ اللَّه شَكَا حَاجَةً شَديدَةً وَعيَالاً، فَرَحمْتُهُ فَخَلَّيْتُ سَبيلَهُ. قَالَ: «أَمَا إِنَّهُ قَدْ كَذَبَكَ وَسَيَعُودُ». فَرَصَدْتُهُ الثَّالثَةَ فَجَاءَ يَحْثُو منَ الطَّعَام، فَأَخَذْتُهُ فَقُلْتُ لأَرْفَعَنَّكَ إِلَى رَسُول اللَّه ﷺ، وَهَذَا آخرُ ثَلاَث مَرَّات أَنَّكَ تَزْعُمُ لاَ تَعُودُ ثُمَّ تَعُودُ. قَالَ دَعْنى أُعَلِّمْكَ كَلمَات يَنْفَعُكَ اللَّهُ بهَا. قُلْتُ مَا هُوَ قَالَ إِذَا أَوَيْتَ إِلَى فرَاشكَ فَاقْرَأْ آيَةَ الْكُرْسىِّ ﴿ ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَ ٱلْحَىُّ ٱلْقَيُّومُ ﴾ حَتَّى تَخْتمَ الآيَةَ، فَإِنَّكَ لَنْ يَزَالَ عَلَيْكَ منَ اللَّه حَافظٌ وَلاَ يَقْرَبَنَّكَ شَيْطَانٌ حَتَّى تُصْبحَ. فَخَلَّيْتُ سَبيلَهُ فَأَصْبَحْتُ، فَقَالَ لى رَسُولُ اللَّه ﷺ: «مَا فَعَلَ أَسيرُكَ الْبَارحَةَ». قُلْتُ يَا رَسُولَ اللَّه زَعَمَ أَنَّهُ يُعَلِّمُنى كَلمَات، يَنْفَعُنى اللَّهُ بهَا، فَخَلَّيْتُ سَبيلَهُ. قَالَ: «مَا هىَ؟» قُلْتُ قَالَ لى إِذَا أَوَيْتَ إِلَى فرَاشكَ فَاقْرَأْ آيَةَ الْكُرْسىِّ منْ أَوَّلهَا حَتَّى تَخْتمَ ﴿ ٱللَّهُ لَآ إِلَٰهَ إِلَّا هُوَ ٱلْحَىُّ ٱلْقَيُّومُ ﴾ وَقَالَ لى لَنْ يَزَالَ عَلَيْكَ منَ اللَّه حَافظٌ وَلاَ يَقْرَبَكَ شَيْطَانٌ حَتَّى تُصْبحَ، وَكَانُوا أَحْرَصَ شَىْءٍ عَلَى الْخَيْر. فَقَالَ النَّبىُّ ﷺ: «أَمَا إِنَّهُ قَدْ صَدَقَكَ وَهُوَ كَذُوبٌ، تَعْلَمُ مَنْ تُخَاطبُ مُنْذُ ثَلاَث لَيَالٍ يَا أَبَا هُرَيْرَةَ». قَالَ لاَ. قَالَ: «ذَاكَ شَيْطَانٌ». [رواه البخاري: ٢٣١١]

**1066.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ ramazan ayında yığılmış zəkatı qoruyub saxlamağı mənə tapşırdı. Bu əsnada bir nəfər yanıma gəldi və ərzaqdan ovuclayıb (qabına) yığmağa başladı. Mən onu yaxalayıb dedim: "Vallahi, mən səni mütləq Peyğəmbərin ﷺ yanına aparacağam." O yalvarıb: "Mən buna möhtacam, mənim külfətim var, özümün də (bu yeməyə) olduqca ehtiyacım var"– dedi, mən də onu buraxdım. Ertəsi gün Peyğəmbər ﷺ məndən soruşdu: "Ey Əbu Hureyra! Tutduğun əsir nə etdi?" Mən dedim: "Ya Rəsulallah! O (mənə) həm ehtiyaclı, həm də külfət sahibi olduğundan gileyləndi. Buna görə də mənim ona yazığım gəldi və onu buraxdım." Peyğəmbər ﷺ dedi: "O sənə yalan danışıb və o yenə qayıda-

[1] Müəyyən bir işi görmək üçün vəkaləti, səlahiyyəti olan adam.

caq." Mən bilirdim ki, o qayıdacaq, çünki Peyğəmbər ﷺ: "...o yenə qayıdacaq"– deyə xəbər vermişdi. Odur ki, pusquda durub onu gözlədim. O, yenə gəlib ərzaqdan ovuclayaraq (qabına) yığmağa başladı. Mən onu yaxalayıb dedim: "Səni hökmən Peyğəmbərin ﷺ yanına aparacağam." O yalvarıb dedi: "Burax məni! Doğrudan da, mən buna möhtacam və mənim külfətim var. (Söz verirəm ki,) bir daha (bura) qayıtmayacağam." Mənim ona yazığım gəldi və mən yenə onu buraxdım. Ertəsi gün Peyğəmbər ﷺ məndən soruşdu: "Ey Əbu Hureyra! Dünən tutduğun əsir nə etdi?" Mən dedim: "Ya Rəsulallah! O, (mənə) həm möhtac, həm də külfət sahibi olduğundan giley-güzar elədi. Buna görə də mənim ona yazığım gəldi və mən onu buraxdım." Peyğəmbər ﷺ dedi: "O sənə yalan danışıb və o yenə qayıdacaq." Mən üçüncü dəfə pusquda dayanıb onu gözlədim. O, yenə gəlib ərzaqdan ovuclayaraq (qabına) yığmağa başladı. Mən onu yaxalayıb dedim: "Mən səni hökmən Peyğəmbərin ﷺ yanına aparacağam. Artıq üçüncü dəfədir ki, sən qayıtmayacağına söz verir, sonra da qayıdırsan." O yalvarıb dedi: "Məni buraxsan, sənə elə sözlər öyrədərəm ki, Allah onların vasitəsilə sənə fayda verər." Mən: "O nə sözdür?"– deyə soruşdum. O dedi: "Yatağına uzananda Kürsü – "Allah, Ondan başqa ilah yoxdur, *əbədi* Yaşayandır, *bütün yaratdıqlarının* Qəyyumudur..."[1] – ayəsini axıra qədər oxu. Əgər bunu etsən, səhər yuxudan oyananadək sənin yanında Allahın təyin etdiyi gözətçi (bir mələk) durar və şeytan sənə yaxınlaşmaz." Mən yenə onu buraxdım. Səhəri gün Peyğəmbər ﷺ məndən soruşdu: "Dünən tutduğun əsir nə etdi?" Mən dedim: "Ya Rəsulallah! O, Allahın izni ilə mənə faydası olacaq sözlər öyrədəcəyini söylədi və mən də onu buraxdım." Peyğəmbər ﷺ: "Nədir o?"– deyə soruşdu. Mən dedim: "O mənə söylədi ki, yatağına uzananda Kürsü – "Allah, Ondan başqa ilah yoxdur, *əbədi* Yaşayandır, *bütün yaratdıqlarının* Qəyyumudur..." – ayəsini əvvəldən axıra qədər oxu. Əgər bunu etsən, səhər yuxudan oyananadək sənin yanında Allahın təyin etdiyi gözətçi (bir mələk) durar və şeytan sənə yaxınlaşmaz."

Səhabələr xeyirli işlərə ən çox can atan insanlar idi.

Peyğəmbər ﷺ dedi: "O sənə doğru söylədi, halbuki özü qatı yalançıdır. Sən üç gecədir kiminlə söhbət etdiyini bilirsənmi, ey Əbu Hureyra?" Mən: "Xeyr!"– deyə cavab verdikdə, Peyğəmbər ﷺ dedi: "Bu, şeytan idi!" (əl-Buxari, 2311)

## 6-cı fəsil. Əgər vəkil bir şeyi fırıldaq işlədərək satarsa, onun bu sövdəsi qəbul olunmaz

## ٦– باب: إِذَا بَاعَ الْوَكِيلُ شَيْئًا فَاسِدًا فَبَيْعُهُ مَرْدُود

١٠٦٧ – عَنْ أَبِي سَعِيد الْخُدْرِيَّ ﷺ قَالَ: جَاءَ بِلاَلٌ إِلَى النَّبِيِّ ﷺ بِتَمْرٍ بَرْنِيٍّ فَقَالَ لَهُ النَّبِيُّ ﷺ: «مِنْ أَيْنَ هَذَا». قَالَ بِلاَلٌ كَانَ عِنْدَنَا تَمْرٌ رَدِيٌّ، فَبِعْتُ مِنْهُ صَاعَيْنِ بِصَاعٍ، لِنُطْعِمَ النَّبِيَّ ﷺ فَقَالَ النَّبِيُّ ﷺ عِنْدَ ذَلِكَ: «أَوَّهْ أَوَّهْ عَيْنُ الرِّبَا عَيْنُ الرِّبَا، لاَ تَفْعَلْ، وَلَكِنْ إِذَا أَرَدْتَ أَنْ تَشْتَرِيَ فَبِعِ التَّمْرَ بِبَيْعٍ آخَرَ ثُمَّ اشْتَرِهِ». [رواه البخاري: ٢٣١٢]

[1] "əl-Bəqərə" surəsi, 255.

**1067.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "(Bir dəfə) Bilal Peyğəmbərə ﷺ bərni[1] xurması gətirdi. Peyğəmbər ﷺ ondan soruşdu: "Bu haradandır?" Bilal dedi: "Bizim köhnə xurmamız var idi. Mən köhnə xurmalardan iki saa verib bir saa (əla növ) xurma aldım ki, Peyğəmbər ﷺ ondan yesin. Peyğəmbər ﷺ dedi: "Ax! Ax! Bu, əsl ribadır![2] Bu, əsl ribadır! (Bir də) belə şey eləmə! Əgər (əla) növ xurma almaq istəyirsənsə, onda əvvəlcə köhnə xurmanı sat, sonra (istədiyin) xurmanı al." (əl-Buxari, 2312)

## 7-ci fəsil. Cəzanı yerinə yetirməyə dair vəkalət vermək

## ٧– باب: الْوَكَالَةُ فِى الْحُدُودِ

١٠٦٨ – عَنْ عُقْبَةَ بْنِ الْحَارِث ﷺ قَالَ: جِيءَ بِالنُّعَيْمَانِ أَوِ ابْنِ النُّعَيْمَان شَارِبًا، فَأَمَرَ رَسُولُ اللَّه ﷺ مَنْ كَانَ فِى الْبَيْتِ أَنْ يَضْرِبُوا قَالَ فَكُنْتُ أَنَا فِيمَنْ ضَرَبَهُ، فَضَرَبْنَاهُ بِالنِّعَالِ وَالْجَرِيدِ. [رواه البخاري: ٢٣١٦]

**1068.** Rəvayət edilir ki, Uqbə ibn Haris ﷺ demişdir: "(Bir dəfə) Nueymanı, yaxud Nueymanın oğlunu içkili halda (Peyğəmbərin ﷺ yanına) gətirdilər. Peyğəmbər ﷺ evində olan adamlara onu vurmağı əmr etdi. Mən onu vuranların arasında idim. Biz onu səndəl və xurma çubuğu ilə döydük." (əl-Buxari, 2316)

---

[1] Əla xurma növü.

[2] Yəni sələmdir.

# ٤٢ – كِتَابُ الْمُزَارَعَةِ

# 42 – Yardarlıq[1] kitabı

## ١ – باب:
## فَضْلُ الزَّرْعِ وَالْغَرْسِ وَ قَوْلُهُ تَعَالَى:
﴿أَفَرَءَيْتُم مَّا تَحْرُثُونَ ﴿٦٣﴾ ءَأَنتُمْ تَزْرَعُونَهُۥٓ أَمْ نَحْنُ ٱلزَّٰرِعُونَ ﴿٦٤﴾ لَوْ نَشَآءُ لَجَعَلْنَٰهُ حُطَٰمًا فَظَلْتُمْ تَفَكَّهُونَ﴾

## 1-ci fəsil.
**(Taxıl) əkməyin və (ağac) basdırmağın fəziləti. Uca Allah buyurur: “Əkdiyinizi gördünüzmü? Onu siz bitirirsiniz, yoxsa Biz? Əgər Biz istəsəydik, onu bir saman çöpünə döndərər, siz də heyrətə gələrdiniz...”[2]**

١٠٦٩ – عَنْ أَنَسٍ ﷺ قَالَ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَا مِنْ مُسْلِمٍ يَغْرِسُ غَرْسًا، أَوْ يَزْرَعُ زَرْعًا، فَيَأْكُلُ مِنْهُ طَيْرٌ أَوْ إِنْسَانٌ أَوْ بَهِيمَةٌ، إِلاَّ كَانَ لَهُ بِهِ صَدَقَةٌ». [رواه البخاري: ٢٣٢٠]

**1069.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hansı bir müsəlman ağac basdırarsa və ya (taxıl və s.) əkərsə, sonra da quşlar, insanlar və heyvanlar onun (məhsulundan) yeyərsə, bu, mütləq ona sədəqə sayılar.” (əl-Buxari, 2320)

## ٢ – باب:
## مَا يُحْذَرُ مِنْ عَوَاقِبِ الاشْتِغَالِ بِآلَةِ الزَّرْعِ أَوْ مُجَاوَزَةِ الْحَدِّ الَّذِى أُمِرَ بِهِ

## 2-ci fəsil.
**Əkinçilik alətlərilə işlədikdə onların hər hansı nəticəsindən ehtiyat etmək və ya qoyulmuş sərhədləri keçməkdən çəkinmək** (gərəkdir)

١٠٧٠ – عَنْ أَبِى أُمَامَةَ الْبَاهِلِيِّ ﷺ، قَالَ – وَرَأَى سِكَّةً وَشَيْئًا مِنْ آلَةِ الْحَرْثِ، فَقَالَ سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «لاَ يَدْخُلُ هَذَا بَيْتَ قَوْمٍ إِلاَّ أَدْخَلَهُ اللَّهُ الذُّلَّ». [رواه البخاري: ٢٣٢١]

**1070.** Rəvayət edilir ki, (bir dəfə) Əbu Ümamə əl-Bahili ﷺ bir kotan və yer şumlamaq üçün istifadə edilən bir alət görüb dedi: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Bunlar hansı bir qövmün evinə daxil olarsa, Allah onları zillətə salar.[3]” (əl-Buxari, 2321)

---

[1] İcarəyə götürülmüş torpaqdan yığılan məhsulun bir hissəsini icarə haqqı olaraq torpaq sahibinə vermə.

[2] “əl-Vaqiə” surəsi, 63-65.

[3] Ehtimal edilir ki, bununla o, əkinçiliklə məşğul olan kimsələrin daha çox təzyiqlərə məruz qalacaqlarını və ya dinindən uzaq düşüb ancaq dünya işlərinə aludə oaln müsəlmanların düşmən tapdağı altında qalacaqlarını qəsd etmişdir. “Fəthul-Bari”, 7/169.

## 3-cü fəsil. Əkin sahələrini qorumaq üçün it saxlamaq

## ٣- باب: اقْتِنَاءُ الْكَلْبِ لِلْحَرْثِ

١٠٧١ - عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ أَمْسَكَ كَلْبًا فَإِنَّهُ يَنْقُصُ كُلَّ يَوْمٍ مِنْ عَمَلِهِ قِيرَاطٌ، إِلاَّ كَلْبَ حَرْثٍ أَوْ مَاشِيَةٍ». [رواه البخاري: ٢٣٢٢]

**1071.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İt saxlayan adamın gündəlik olaraq savabından bir qirat[1] azalar. Yalnız əkin sahəsini və mal-qaranı qoruyan itdən başqa." (əl-Buxari, 2322)

١٠٧٢ - عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ: «إِلاَّ كَلْبَ غَنَمٍ أَوْ حَرْثٍ أَوْ صَيْدٍ». [رواه البخاري: ٢٣٢٢]

**1072.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yalnız çoban itindən, bağ itindən[2] və ov itindən başqa." (əl-Buxari, 2322)

١٠٧٣ - عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ: «كَلْبَ صَيْدٍ أَوْ مَاشِيَةٍ». [رواه البخاري: ٢٣٢٢]

**1073.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yalnız ov itindən və mal-qaranı qoruyan itdən başqa." (əl-Buxari, 2322)

## 4-cü fəsil. İnəyi yer şumlamaq üçün istifadə etmək

## ٤- باب: اسْتِعْمَالُ الْبَقَرِ لِلْحِرَاثَةِ

١٠٧٤ - عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «بَيْنَمَا رَجُلٌ رَاكِبٌ عَلَى بَقَرَةٍ الْتَفَتَتْ إِلَيْهِ. فَقَالَتْ لَمْ أُخْلَقْ لِهَذَا، خُلِقْتُ لِلْحِرَاثَةِ، قَالَ آمَنْتُ بِهِ أَنَا وَأَبُو بَكْرٍ وَعُمَرُ، وَأَخَذَ الذِّئْبُ شَاةً فَتَبِعَهَا الرَّاعِي، فَقَالَ الذِّئْبُ مَنْ لَهَا يَوْمَ السَّبُعِ، يَوْمَ لاَ رَاعِيَ لَهَا غَيْرِي. قَالَ آمَنْتُ بِهِ أَنَا وَأَبُو بَكْرٍ وَعُمَرُ». قَالَ أَبُو سَلَمَةَ مَا هُمَا يَوْمَئِذٍ فِي الْقَوْمِ. [رواه البخاري: ٢٣٢٤]

**1074.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bir dəfə) bir nəfər inəyin belinə minib onu sürərkən inək ona tərəf çevrilib dedi: "Mən bunun üçün yaradılmamışam. Mən yer şümlamaq üçün yaradılmışam." Sonra Peyğəmbər ﷺ buyurdu: "Mən, Əbu Bəkr və Ömər buna inanırıq."

Peyğəmbər ﷺ davam edib dedi: "(Bir dəfə) canavar bir qoyunu tutub apardı. Çoban onu təqib etdikdə canavar dedi: "Məndən başqa bu qoyunun heç bir çobanı olmayacağı, yırtıcı heyvanların hökm sürəcəyi gün onu kim xilas edə bilər?" Sonra Peyğəmbər ﷺ buyurdu: "Mən, Əbu Bəkr və Ömər buna inanırıq."

(Hədisi Əbu Hureyradan ﷺ rəvayət edən) Əbu Sələmə ﷺ demişdir: "Halbuki onlar[3] camaatın arasında yox idilər." (əl-Buxari, 2324)

---

[1] 44-cü hədisə bax.
[2] Burada meyvə bağlarını və əkin sahələrini qoruyan it nəzərdə tutulur.
[3] Yəni Əbu Bəkr ﷺ və Ömər ﷺ.

**5-ci fəsil.** (Bir kimsənin başqa birisinə:) **“Xurma və ya digər ağaclarıma qulluq et[1] və götürdüyüm məhsula şərik ol” deməsi**

٥– باب:
إِذَا قَالَ: اكْفِنِى مَئُونَةَ النَّخْلِ أَوْ غَيْرِهِ، وَتُشْرِكُنِى فِى الثَّمَرِ

١٠٧٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ قَالَ: قَالَتِ الأَنْصَارُ لِلنَّبِىِّ ﷺ اقْسِمْ بَيْنَنَا وَبَيْنَ إِخْوَانِنَا النَّخِيلَ. قَالَ: «لاَ». فَقَالُوا تَكْفُونَا الْمَئُونَةَ وَنُشْرِكْكُمْ فِى الثَّمَرَةِ. قَالُوا سَمِعْنَا وَأَطَعْنَا. [رواه البخاري: ٢٣٢٥]

**1075.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “(Bir dəfə) ənsar Peyğəmbərə ﷺ dedi: “Xurma ağaclarımızı bizimlə (mühacir) qardaşlarımız arasında bölüşdür.” Peyğəmbər ﷺ: “Xeyr!”– deyə buyurdu. Onda onlar (mühacirlərə) dedilər: “Siz bizim ağaclarımıza qulluq edin, biz də sizi götürəcəyimiz məhsula şərik edək.” (Mühacirlər): “Eşidirik və itaət edirik”– dedilər.” (əl-Buxari, 2325)

١٠٧٦ – عَنْ رَافِعِ بْنِ خَدِيجٍ ﵁ قَالَ: كُنَّا أَكْثَرَ أَهْلِ الْمَدِينَةِ مُزْدَرَعًا، كُنَّا نُكْرِى الأَرْضَ بِالنَّاحِيَةِ مِنْهَا مُسَمًّى لِسَيِّدِ الأَرْضِ، قَالَ فَمِمَّا يُصَابُ ذَلِكَ وَتَسْلَمُ الأَرْضُ، وَمِمَّا يُصَابُ الأَرْضُ وَيَسْلَمُ ذَلِكَ، فَنُهِينَا، وَأَمَّا الذَّهَبُ وَالْوَرِقُ فَلَمْ يَكُنْ يَوْمَئِذٍ. [رواه البخاري: ٢٣٢٧]

**1076.** Rəvayət edilir ki, Rafi ibn Xədic ﵁ demişdir: “Mədinə əhli arasında hamıdan çox biz əkinçiliklə məşğul olurduq. Biz tarlanın sahibi üçün ayırdığımız sahədən (götürəcəyimiz) məhsulu ona vermək şərtilə onun tarlasını kirayə götürərdik. Bəzən tarlanın sahibi üçün ayrılan sahənin məhsulu zay olur, qalan hissəsindən isə bol məhsul çıxırdı, bəzəndə tərsinə olurdu. (Nəhayət, Peyğəmbər ﷺ) belə etməyi bizə qadağan etdi. O ki qaldı qızıl və gümüşə, həmin vaxt qızıl və gümüş yox idi.[2]” (əl-Buxari, 2327)

**6-cı fəsil.** (İcarəyə götürülmüş torpaqdan) **yığılan məhsulun yarısını icarə haqqı olaraq torpaq sahibinə vermək**

٦– باب:
الْمُزَارَعَةُ بِالشَّطْرِ

١٠٧٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﵄، أَنَّ النَّبِىَّ ﷺ عَامَلَ خَيْبَرَ بِشَطْرِ مَا يَخْرُجُ مِنْهَا مِنْ ثَمَرٍ أَوْ زَرْعٍ، فَكَانَ يُعْطِى أَزْوَاجَهُ مِائَةَ وَسْقٍ ثَمَانُونَ وَسْقَ تَمْرٍ وَعِشْرُونَ وَسْقَ شَعِيرٍ، فَقَسَمَ عُمَرُ خَيْبَرَ، فَخَيَّرَ أَزْوَاجَ النَّبِىِّ ﷺ أَنْ يُقْطِعَ لَهُنَّ مِنَ الْمَاءِ وَالأَرْضِ، أَوْ يُمْضِىَ لَهُنَّ، فَمِنْهُنَّ مَنِ اخْتَارَ الأَرْضَ وَمِنْهُنَّ مَنِ اخْتَارَ الْوَسْقَ، وَكَانَتْ عَائِشَةُ اخْتَارَتِ الأَرْضَ. [رواه البخاري: ٢٣٢٨]

**1077.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: “Peyğəmbər ﷺ Xeybər (yəhudilərinə) əkin sahələrindən götürdükləri məhsulun yarısını vermək şərtilə o torpaqları onlara icarəyə verdi. Peyğəmbər ﷺ zövcələrinə yüz vəsq[3] – səksən vəsq xurma və iyirmi vəsq arpa verərdi. Sonralar Ömər Xeybəri bölüş-

---

[1] Burada “qulluq et” deyildikdə, ağacları suvarmaq, dibini təmizləmək və s. nəzərdə tutulur.
[2] Yəni o vaxtlar torpağın kirayəsini ödəmək üçün qızıl və gümüş vermirdilər.
[3] 708-ci hədisin qeydlərinə bax.

dürdü[1] və Peyğəmbərin ﷺ zövcələrinə seçim verdi ki, istər (paylarına) düşən suları və torpaq sahələrini götürsünlər, istərsə də (əvvəlki kimi) onlara məhsuldan pay ayrılsın. Bəziləri torpağı, bəziləri də məhsulu seçdilər, Aişə isə torpağı seçdi." (əl-Buxari, 2328)

١٠٧٨ – عَنْ عَمْرٍو قَالَ: قُلْتُ لِطَاوُسٍ لَوْ تَرَكْتَ الْمُخَابَرَةَ فَإِنَّهُمْ يَزْعُمُونَ أَنَّ النَّبِيَّ ﷺ نَهَى عَنْهُ. قَالَ أَيْ عَمْرُو، إِنِّي أُعْطِيهِمْ وَأُغْنِيهِمْ، وَإِنَّ أَعْلَمَهُمْ أَخْبَرَنِي – يَعْنِي ابْنَ عَبَّاسٍ – أَنَّ النَّبِيَّ ﷺ لَمْ يَنْهَ عَنْهُ، وَلَكِنْ قَالَ: «أَنْ يَمْنَحَ أَحَدُكُمْ أَخَاهُ خَيْرٌ لَهُ مِنْ أَنْ يَأْخُذَ عَلَيْهِ خَرْجًا مَعْلُومًا». [رواه البخاري: ٢٣٣٠]

**1078.** Rəvayət edilir ki, Amr demişdir: "(Bir dəfə) mən Tavusa dedim: "Müxabərəni"[2] tərk etsən yaxşı olar. Çünki camaat Peyğəmbərin ﷺ bunu qadağan etdiyini söyləyir."

Tavus dedi: "Ey Amr, mən onlara (kirayəyə əkin sahəsi) verir və onları ehtiyacdan qurtarıram. Onların ən ağıllısı – ibn Abbas – mənə xəbər vermişdir ki, Peyğəmbər ﷺ bunu qadağan etməmişdir. Fəqət o buyurmuşdur: "Birinizin, (əkin sahəsini) öz qardaşına havayı verməsi, onun üçün (həmin torpağı müəyyən muzd) müqabilində kirayə verməsindən daha xeyirlidir." (əl-Buxari, 2330)

## 7-ci fəsil. Peyğəmbərin ﷺ əshabələrinin vəqf[3] etdiyi ərazilər, xərac götürülən ərazi, habelə (zimmilərlə[4]) yardarlıq və digər sövdələşmələrdə saziş bağlamaq

## ٧– باب: باب أَوْقَافُ أَصْحَابِ النَّبِيِّ ﷺ وَأَرْضُ الْخَرَاجِ وَمُزَارَعَتُهُمْ وَمُعَامَلَتُهُمْ

١٠٧٩ – عَنْ عُمَرَ رضي الله عنه أَنَّهُ قَالَ: لَوْلاَ آخِرُ الْمُسْلِمِينَ مَا فَتَحْتُ قَرْيَةً إِلاَّ قَسَمْتُهَا بَيْنَ أَهْلِهَا كَمَا قَسَمَ النَّبِيُّ ﷺ خَيْبَرَ. [رواه البخاري: ٢٣٣٤]

**1079.** Rəvayət edilir ki, Ömər ﷺ demişdir: "Əgər (gələcək) müsəlman nəsillər olmasaydı, Peyğəmbər ﷺ Xeybəri paylaşdırdığı kimi, mən də fəth etdiyim hər məmləkəti ona haqqı çatan kimsələrin arasında bölüşdürərdim." (əl-Buxari, 2334)

## 8-ci fəsil. Ölü bir torpağı diriltmək

## ٨– باب: مَنْ أَحْيَا أَرْضًا مَوَاتًا

١٠٨٠ – عَنْ عَائِشَةَ رضي الله عنها عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ أَعْمَرَ أَرْضًا لَيْسَتْ لأَحَدٍ فَهُوَ أَحَقُّ». [رواه البخاري: ٢٣٣٥]

**1080.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim heç kəsə məxsus olmayan bir ərazini götürüb becərərsə, (bu əraziyə sahib olmağa) daha çox haqqı çatar." (əl-Buxari, 2335)

---

[1] Yəni xəlifə olduqdan sonra yəhudiləri oradan köçürtdü və o torpaqları müsəlmanlara payladı.

[2] İcarəyə götürülmüş torpaqdan yığılan məhsulun bir hissəsini icarə haqqı olaraq torpaq sahibinə vermək.

[3] 746-ci hədisin qeydlərinə bax.

[4] Müsəlman ölkəsində muzdla işləyən kafir.

## 9-cu fəsil. Əgər torpaq sahibi müəyyən bir vaxt təyin etmədən (kimsəyə): “Allah istədiyi qədər burada əkib becərə bilərsən”– deyərsə, tərəflər qarşılıqlı razılığa görə hərəkət etməlidirlər

٩– باب:
إِذَا قَالَ رَبُّ الأَرْضِ أُقِرُّكَ مَا أَقَرَّكَ اللَّهُ وَلَمْ يَذْكُرْ أَجَلاً مَعْلُومًا فَهُمَا عَلَى تَرَاضِيهِمَا

١٠٨١ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ عُمَرَ بْنَ الْخَطَّابِ رضي الله عنه أَجْلَى الْيَهُودَ وَالنَّصَارَى مِنْ أَرْضِ الْحِجَازِ، وَكَانَ رَسُولُ اللَّهِ ﷺ لَمَّا ظَهَرَ عَلَى خَيْبَرَ أَرَادَ إِخْرَاجَ الْيَهُودِ مِنْهَا، وَكَانَتِ الأَرْضُ حِينَ ظَهَرَ عَلَيْهَا لِلَّهِ وَلِرَسُولِهِ ﷺ وَلِلْمُسْلِمِينَ، وَأَرَادَ إِخْرَاجَ الْيَهُودِ، مِنْهَا فَسَأَلَتِ الْيَهُودُ رَسُولَ اللَّهِ ﷺ لِيُقِرَّهُمْ بِهَا أَنْ يَكْفُوا عَمَلَهَا وَلَهُمْ نِصْفُ الثَّمَرِ، فَقَالَ لَهُمْ رَسُولُ اللَّهِ ﷺ: «نُقِرُّكُمْ بِهَا عَلَى ذَلِكَ مَا شِئْنَا». فَقَرُّوا بِهَا حَتَّى أَجْلاَهُمْ عُمَرُ إِلَى تَيْمَاءَ وَأَرِيحَاءَ. [رواه البخاري: ٢٣٣٨]

**1081.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: “Ömər ibn Xəttab yəhudi və xristianları Hicaz torpağından qovub çıxarmışdır. Peyğəmbər ﷺ Xeybər fəth edildiyi zaman yəhudiləri oradan çıxarmaq istəmişdi. Xeybər fəth edildikdən sonra o torpaqlar Allaha, Onun elçisinə ﷺ və müsəlmanlara məxsus olmuşdu. Peyğəmbər ﷺ yəhudiləri oradan çıxarmaq istədikdə onlar Peyğəmbərdən ﷺ xahiş etdilər ki, onlara həmin torpaqlarda işləyib götürdükləri məhsulun yarısını müsəlmanlara vermək şərtilə orada qalmağa izn versin. Onda Peyğəmbər ﷺ onlara dedi: “(Bu şərtlərlə siz) bizim istədiyimiz qədər orada qala bilərsiniz.” Beləliklə, Ömər onları Teymaya və Əriyhaya[1] qovanadək onlar orada qaldılar.” (əl-Buxari, 2338)

## 10-cu fəsil. Peyğəmbərin ﷺ əshabələrinin (tarladan götürdükləri) məhsulu və meyvələri bir-biriləri ilə bölüşdürməsi

١٠– باب:
مَا كَانَ مِنْ أَصْحَابِ النَّبِيِّ ﷺ يُوَاسِي بَعْضُهُمْ بَعْضًا فِي الزِّرَاعَةِ وَالثَّمَرَةِ

١٠٨٢ – عَنْ رَافِعِ بْنِ خَدِيجٍ عَنْ عَمِّهِ ظُهَيْرِ بْنِ رَافِعٍ رضي الله عنه لَقَدْ نَهَانَا رَسُولُ اللَّهِ ﷺ عَنْ أَمْرٍ كَانَ بِنَا رَافِقًا. قُلْتُ مَا قَالَ رَسُولُ اللَّهِ ﷺ فَهُوَ حَقٌّ. قَالَ دَعَانِي رَسُولُ اللَّهِ ﷺ قَالَ: «مَا تَصْنَعُونَ بِمَحَاقِلِكُمْ». قُلْتُ نُؤَاجِرُهَا عَلَى الرُّبُعِ وَعَلَى الأَوْسُقِ مِنَ التَّمْرِ وَالشَّعِيرِ. قَالَ: «لاَ تَفْعَلُوا ازْرَعُوهَا أَوْ أَزْرِعُوهَا أَوْ أَمْسِكُوهَا». قَالَ رَافِعٌ قُلْتُ سَمْعًا وَطَاعَةً. [رواه البخاري: ٢٣٣٩]

**1082.** Rəvayət edilir ki, Rafi ibn Xədic əmisi Zuheyr ibn Rafidən ﷺ rəvayət edib demişdir: “Peyğəmbər ﷺ bizim üçün asan olan bir şeyi bizə qadağan etmişdir.” Mən dedim: “Peyğəmbər ﷺ nə demişdirsə, hamısı doğrudur.”

(Zuheyr davam edib) dedi: “(Bir dəfə) Peyğəmbər ﷺ məni çağırıb soruşdu: “Əkin sahələrinizdə nə işlər görürsünüz?” Dedim: “Biz o sahələri, (oradan götürüləcək məhsulun) dörddə biri, yaxud bir neçə vəsq[2] xurma ya da arpa müqabilində kirayə veririk.” O buyurdu: “Belə etməyin! Ya özünüz bu sahələrdə əkin, ya onu (havayı olaraq) başqalarına verin, ya da orada heç nə əkməyin!”

[1] Teyma – Ərəb yarımadasının şimalında yerləşən ərazi; Əriyha – Şam şəhərlərindən biri.
[2] 708-ci hədisin qeydlərinə bax.

(Rafi ibn Xədic) dedi: "Eşidirəm və itaət edirəm!" (əl-Buxari, 2339)

١٠٨٣ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ كَانَ يُكْرِى مَزَارِعَهُ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ وَأَبِى بَكْرٍ وَعُمَرَ وَعُثْمَانَ، وَصَدْرًا مِنْ إِمَارَةِ مُعَاوِيَةَ. ثُمَّ حُدِّثَ عَنْ رَافِعِ بْنِ خَدِيجٍ: أَنَّ النَّبِيَّ ﷺ نَهَى عَنْ كِرَاءِ الْمَزَارِعِ، فَذَهَبَ ابْنُ عُمَرَ إِلَى رَافِعٍ فَسَأَلَهُ فَقَالَ نَهَى النَّبِيُّ ﷺ عَنْ كِرَاءِ الْمَزَارِعِ. فَقَالَ ابْنُ عُمَرَ قَدْ عَلِمْتَ أَنَّا كُنَّا نُكْرِى مَزَارِعَنَا عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ بِمَا عَلَى الأَرْبِعَاءِ وَبِشَىْءٍ مِنَ التِّبْنِ. [رواه البخاري: ٢٣٤٣-٢٣٤٤]

**1083.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما öz əkin sahələrini Peyğəmbərin ﷺ, Əbu Bəkrin, Ömərin, Osmanın dövründə və Müaviyənin xilafətinin əvvəlki illərində kirayə verərdi. Sonra ona xəbər verdilər ki, Rafi ibn Xədic Peyğəmbərin ﷺ əkin sahələrini kirayə verməyi qadağan etdiyini rəvayət edir. Onda ibn Ömər Rafinin yanına gedib (bu haqda) ondan soruşdu. Rafi dedi: "Peyğəmbər ﷺ əkin sahələrini kirayə verməyi qadağan etmişdir." İbn Ömər dedi: "Sən bilirsən ki, biz Peyğəmbərin ﷺ zamanında əkin sahələrimizi çay kənarında bitən bitkilərin və müəyyən miqdar saman müqabilində kirayə verərdik." (əl-Buxari, 2343-2344)

١٠٨٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: كُنْتُ أَعْلَمُ فِى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ أَنَّ الأَرْضَ تُكْرَى. ثُمَّ خَشِىَ عَبْدُ اللَّهِ أَنْ يَكُونَ النَّبِيُّ ﷺ قَدْ أَحْدَثَ فِى ذَلِكَ شَيْئًا لَمْ يَكُنْ يَعْلَمُهُ، فَتَرَكَ كِرَاءَ الأَرْضِ. [رواه البخاري: ٢٣٤٥]

**1084.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Mən Peyğəmbərin ﷺ zamanında elə bilirdim ki, torpaq sahəsini kirayə vermək olar."

Sonra ibn Ömər Peyğəmbərin ﷺ bu xüsusda onun bilmədiyi bir hökmü vermiş olduğundan, ehtiyat edib torpağı kirayə verməkdən vaz keçdi. (əl-Buxari, 2345)

## 11-ci fəsil

## ١١– باب

١٠٨٥ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَوْمًا يُحَدِّثُ وَعِنْدَهُ رَجُلٌ مِنْ أَهْلِ الْبَادِيَةِ: «أَنَّ رَجُلاً مِنْ أَهْلِ الْجَنَّةِ اسْتَأْذَنَ رَبَّهُ فِى الزَّرْعِ فَقَالَ لَهُ أَلَسْتَ فِيمَا شِئْتَ قَالَ بَلَى وَلَكِنِّى أُحِبُّ أَنْ أَزْرَعَ. قَالَ فَبَذَرَ فَبَادَرَ الطَّرْفَ نَبَاتُهُ وَاسْتِوَاؤُهُ وَاسْتِحْصَادُهُ، فَكَانَ أَمْثَالَ الْجِبَالِ فَيَقُولُ اللَّهُ دُونَكَ يَا ابْنَ آدَمَ، فَإِنَّهُ لاَ يُشْبِعُكَ شَىْءٌ». فَقَالَ الأَعْرَابِىُّ وَاللَّهِ لاَ تَجِدُهُ إِلاَّ قُرَشِيًّا أَوْ أَنْصَارِيًّا، فَإِنَّهُمْ أَصْحَابُ زَرْعٍ، وَأَمَّا نَحْنُ فَلَسْنَا بِأَصْحَابِ زَرْعٍ. فَضَحِكَ النَّبِيُّ ﷺ. [رواه البخاري: ٢٣٤٨]

**1085.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, bir dəfə bədəvilərdən birisi Peyğəmbərin ﷺ yanında ikən Peyğəmbər ﷺ belə bir hədis danışdı ki: "Cənnət əhlindən biri Rəbbindən orada əkinçiliklə məşğul olmaq üçün izn istəyəcək." (Rəbbi ona) buyuracaq: "Məgər istədiklərinə nail olmamısan?" Adam deyəcək: "Elədir, lakin mən əkin əkməyi sevirəm." (Onda ona izn veriləcək və o) torpağa toxum səpəcək. Toxumlar bir göz qırpımında cücərib yetişəcək və bol məhsul verəcək; (o məhsul) dağ boyda olacaq." Onda Allah ona buyuracaq: "Götür onları, ey Adəm oğlu! Həqiqətən, heç bir şey sənin gözünü doydura bilməz."

(Peyğəmbərin ﷺ yanındakı) bədəvi dedi: "Vallahi, bu adam olsa-olsa, ya qureyşdən, ya da ənsardan bir kimsə olacaq. Əkinçiliklə məşğul olan onlardır, biz yox." Peyğəmbər ﷺ (onun bu sözünə) gülümsədi. (əl-Buxari, 2348)

# ٤٣ – كِتَابُ الْمُسَاقَاةِ

# 43 – Su ilə təmin etmə kitabı

## ١ – باب: مَنْ رَأَى صَدَقَةَ الْمَاءِ وَهِبَتَهُ وَوَصِيَّتَهُ جَائِزَةً، مَقْسُومًا كَانَ أَوْ غَيْرَ مَقْسُومٍ

**1-ci fəsil. İstər bölünmüş, istər bölünməmiş olsun, suyun** (insanlara) **sədəqə verilməsini, hədiyyə olunmasını və ya vəsiyyət edilməsini caiz hesab edən kimsə haqqında**

١٠٨٦ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﷺ قَالَ: أُتِىَ النَّبِىُّ ﷺ بِقَدَحٍ فَشَرِبَ مِنْهُ، وَعَنْ يَمِينِهِ غُلاَمٌ أَصْغَرُ الْقَوْمِ، وَالأَشْيَاخُ عَنْ يَسَارِهِ فَقَالَ: «يَا غُلاَمُ أَتَأْذَنُ لِى أَنْ أُعْطِيَهُ الأَشْيَاخَ». قَالَ مَا كُنْتُ لأُوثِرَ بِفَضْلِى مِنْكَ أَحَدًا يَا رَسُولَ اللَّهِ. فَأَعْطَاهُ إِيَّاهُ. [رواه البخاري: ٢٣٥١]

**1086.** Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbərə ﷺ bir cam süd gətirdilər və o, bu süddən içdi. (Həmin vaxt) onun sağında (məclisdəkilərin) ən kiçiyi – yeniyetmə[1] bir oğlan, solunda isə yaşlı adamlar oturmuşdu. Peyğəmbər ﷺ (yeniyetməyə) dedi: "Cavan oğlan! Mənə izn verirsənmi, bunu qocalara verim?"[2] (Cavan oğlan cavabında) dedi: "Sənin artığını (birinci olaraq içmək) xüsusunda heç kəsə güzəştə gedən deyiləm, ya Rəsulullah." (Buna görə də) Peyğəmbər ﷺ camı o cavan oğlana verdi." (əl-Buxari, 2351)

١٠٨٧ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّهَا حُلِبَتْ لِرَسُولِ اللَّهِ ﷺ شَاةٌ دَاجِنٌ وَهُوَ فِى دَارِ أَنَسِ بْنِ مَالِكٍ، وَشِيبَ لَبَنُهَا بِمَاءٍ مِنَ الْبِئْرِ الَّتِى فِى دَارِ أَنَسٍ، فَأَعْطَى رَسُولَ اللَّهِ ﷺ الْقَدَحَ فَشَرِبَ مِنْهُ، حَتَّى إِذَا نَزَعَ الْقَدَحَ مِنْ فِيهِ، وَعَلَى يَسَارِهِ أَبُو بَكْرٍ وَعَنْ يَمِينِهِ أَعْرَابِىٌّ فَقَالَ عُمَرُ وَخَافَ أَنْ يُعْطِيَهُ الأَعْرَابِىَّ أَعْطِ أَبَا بَكْرٍ يَا رَسُولَ اللَّهِ عِنْدَكَ. فَأَعْطَاهُ الأَعْرَابِىَّ الَّذِى عَلَى يَمِينِهِ، ثُمَّ قَالَ: «الأَيْمَنَ فَالأَيْمَنَ». [رواه البخاري: ٢٣٥٢]

**1087.** Ənəs ibn Malik ﷺ rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ onların evində olarkən, onun üçün ağılda[3] bəslənmiş bir qoyunun südünü sağdılar və bu südə Ənəsin həyətindəki quyunun suyundan əlavə etdilər. Sonra Peyğəmbərə ﷺ bir bardaq (süd) verdilər və o, bu süddən içdi. Bardağı ağzından çəkdiyi zaman onun solunda Əbu Bəkr, sağında isə bir bədəvi (oturmuşdu). Bu dəmdə Ömər Peyğəmbərin ﷺ bardağı bədəviyə verəcəyindən ehtiyat edib: "Ya Rəsulullah, (onu) yanında (oturan) Əbu Bəkrə ver"– dedi. (Lakin Peyğəmbər ﷺ) bardağı sağında (oturmuş) bədəviyə verdi və dedi: "(Növbə ilə) sağda (oturanlara ötürmək lazımdır)." (əl-Buxari, 2352)

---

[1] Söhbət həmin vaxt hələ on üç yaşı tamam olmamış ibn Abbasdan ﷺ gedir.

[2] Peyğəmbər ﷺ hər işində sağ tərəfindən başlamağı xoşlayırdı deyə, bu cam ilk əvvəl sağında oturana çatmalı idi.

[3] Mal-qara və qoyun saxlamaq üçün ətrafı tikan və ya ağac ilə hasarlanmış üstüaçıq yer.

## ٢- باب: مَنْ قَالَ إِنَّ صَاحِبَ الْمَاءِ أَحَقُّ بِالْمَاءِ حَتَّى يَرْوَى

## 2-ci fəsil. "Su sahibinin sudan istədiyi qədər istifadə etməyə daha çox haqqı var" deyən kimsə

١٠٨٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ يُمْنَعُ فَضْلُ الْمَاءِ لِيُمْنَعَ بِهِ الْكَلأُ». [رواه البخاري: ٢٣٥٣]

**1088.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Otlaqda (otlayan qoyunların) artıq qalmış sudan içməyinə maneçilik törətmək olmaz.[1]" (əl-Buxari, 2353)

١٠٨٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ تَمْنَعُوا فَضْلَ الْمَاءِ لِتَمْنَعُوا بِهِ فَضْلَ الْكَلإِ». [رواه البخاري: ٢٣٥٤]

**1089.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Kiminsə) otlaqdan istifadə etməsinə mane olmaq üçün onun artıq qalmış sudan istifadə etməyinə mane olmayın." (əl-Buxari, 2354)

## ٣- باب: الْخُصُومَةُ فِي الْبِئْرِ وَالْقَضَاءُ فِيهَا

## 3-cü fəsil. Su quyusu üstündə mübahisə etmək və onun hökmü

١٠٩٠ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ حَلَفَ عَلَى يَمِينٍ يَقْتَطِعُ بِهَا مَالَ امْرِئٍ، هُوَ عَلَيْهَا فَاجِرٌ، لَقِيَ اللَّهَ وَهُوَ عَلَيْهِ غَضْبَانُ، فَأَنْزَلَ اللَّهُ تَعَالَى: ﴿إِنَّ الَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ اللَّهِ وَأَيْمَانِهِمْ ثَمَنًا قَلِيلًا﴾ الآيَةَ، فَجَاءَ الأَشْعَثُ فَقَالَ: مَا حَدَّثَكُمْ أَبُو عَبْدِ الرَّحْمَنِ فِيَّ أُنْزِلَتْ هَذِهِ الآيَةُ، كَانَتْ لِي بِئْرٌ فِي أَرْضِ ابْنِ عَمٍّ لِي فَقَالَ لِي: «شُهُودَكَ». قُلْتُ مَا لِي شُهُودٌ. قَالَ: «فَيَمِينُهُ». قُلْتُ يَا رَسُولَ اللَّهِ إِذًا يَحْلِفَ. فَذَكَرَ النَّبِيُّ ﷺ هَذَا الْحَدِيثَ، فَأَنْزَلَ اللَّهُ ذَلِكَ تَصْدِيقًا لَهُ. [رواه البخاري: ٢٣٥٦-٢٣٥٧]

**1090.** Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim başqa birisini malından məhrum etmək məqsədilə yalandan and içərsə, Allahın hüzuruna gələcəyi gün Allahın ona qəzəbi tutar." Sonra Uca Allah bu ayəni nazil etdi: "Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur. Qiyamət günü Allah onları danışdırmayacaq, onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Onlar üçün ağrılı-acılı bir əzab vardır."[2]

Bu dəmdə Əşəs ibn Qeys ﷺ gəlib dedi: "Əbu Abdur-Rəhmanın sizə rəvayət etdiyi bu hadisə, əslində, mənə aiddir, bu ayə mənə görə nazil olmuşdur. Belə ki, əmim oğlunun torpaq sahəsində mənə məxsus bir su quyusu var idi. (Bizim aramıza mübahisə düşdükdə) Peyğəmbər ﷺ mənə: "Şahidlərini (gətir)!"– deyə buyurdu. Mən: "Şahidim yoxdur"– dedim. Peyğəmbər ﷺ buyurdu: "Elə isə qoy o[3] and içsin!" Mən dedim: "Ya Rəsulullah, o, (yalandan) and

---

[1] Bu o deməkdir ki, əgər su quyusunun ətrafında otlaq varsa və orada bu quyudan başqa heç bir quyu yoxdursa, quyu sahibi orada otlayan qoyunların su içməsinə mane olmamalıdır. Çünki əgər qoyunlar doyunca otladıqdan sonra su içməsələr, otlamağa davam edə bilməyəcək və belə olduğu təqdirdə çobanlar məcbur qalıb başqa su hövzələri axtaracaqlar. Buradan da belə nəticə çıxır ki, onların su içməsinə mane olmaq, elə onların otlaqda otlamasına mane olmaq deməkdir. Bunu etmək isə qadağandır.

[2] "Ali-İmran" surəsi, 77.

[3] Yəni, "qoy əmin oğlu quyunun ona məxsus olduğuna dair and içsin".

içəcək." Onda Peyğəmbər ﷺ bu hədisi[1] danışdı və Uca Allah da onun dediklərini təsdiq etmək üçün bu ayəni nazil etdi. (əl-Buxari, 2356-2357)

## 4-cü fəsil. Müsafirin su içməsinə mane olan kimsənin günahı

## ٤– باب: إِثْمُ مَنْ مَنَعَ ابْنَ السَّبِيلِ مِنَ الْمَاءِ

١٠٩١ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «ثَلاَثَةٌ لاَ يَنْظُرُ اللَّهُ إِلَيْهِمْ يَوْمَ الْقِيَامَةِ، وَلاَ يُزَكِّيهِمْ، وَلَهُمْ عَذَابٌ أَلِيمٌ رَجُلٌ كَانَ لَهُ فَضْلُ مَاءٍ بِالطَّرِيقِ، فَمَنَعَهُ مِنِ ابْنِ السَّبِيلِ، وَرَجُلٌ بَايَعَ إِمَامًا لاَ يُبَايِعُهُ إِلاَّ لِدُنْيَا، فَإِنْ أَعْطَاهُ مِنْهَا رَضِيَ، وَإِنْ لَمْ يُعْطِهِ مِنْهَا سَخِطَ، وَرَجُلٌ أَقَامَ سِلْعَتَهُ بَعْدَ الْعَصْرِ، فَقَالَ وَاللَّهِ الَّذِى لاَ إِلَهَ غَيْرُهُ لَقَدْ أَعْطَيْتُ بِهَا كَذَا وَكَذَا، فَصَدَّقَهُ رَجُلٌ، ثُمَّ قَرَأَ هَذِهِ الآيَةَ: ﴿إِنَّ الَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ اللَّهِ وَأَيْمَانِهِمْ ثَمَنًا قَلِيلًا﴾. [رواه البخاري: ٢٣٥٨]

**1091.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü üç sinif insan olacaq ki, Allah onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Üstəlik onları üzücü bir əzab gözləyir:

– o adam ki, yol kənarındakı suya sahib olmuş və (oradan keçən) müsafirlərə bu sudan verməmişdir;

– o adam ki, əmirə yalnız dünya xatirinə beyət etmiş və əmir dünya malından ona verdikdə ondan razı qalmış, heç nə vermədikdə isə ona qəzəbi tutmuşdur;

– o adam ki, malını axşam çağı satmağa çıxarıb: "Özündən başqa məbud olmayan Allaha and olsun ki, bu mala filan qədər pul vermişəm"- deyər, camaat da ona inanar.

Sonra Peyğəmbər ﷺ bu ayəni oxudu: "Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur. Qiyamət günü Allah onları danışdırmayacaq, onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Onlar üçün ağrılı-acılı bir əzab vardır."[2] (əl-Buxari, 2358)

## 5-ci fəsil. (Su içmək istəyənlərə) su verməyin fəziləti

## ٥– باب: فَضْلُ سَقْيِ الْمَاءِ

١٠٩٢ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «بَيْنَا رَجُلٌ يَمْشِى فَاشْتَدَّ عَلَيْهِ الْعَطَشُ، فَنَزَلَ بِئْرًا فَشَرِبَ مِنْهَا، ثُمَّ خَرَجَ فَإِذَا هُوَ بِكَلْبٍ يَلْهَثُ، يَأْكُلُ الثَّرَى مِنَ الْعَطَشِ، فَقَالَ لَقَدْ بَلَغَ هَذَا مِثْلُ الَّذِى بَلَغَ بِى فَمَلأَ خُفَّهُ ثُمَّ أَمْسَكَهُ بِفِيهِ، ثُمَّ رَقِىَ، فَسَقَى الْكَلْبَ فَشَكَرَ اللَّهُ لَهُ، فَغَفَرَ لَهُ». قَالُوا يَا رَسُولَ اللَّهِ، وَإِنَّ لَنَا فِى الْبَهَائِمِ أَجْرًا قَالَ: «فِى كُلِّ كَبِدٍ رَطْبَةٍ أَجْرٌ». [رواه البخاري: ٢٣٦٣]

**1092.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bir dəfə) bir adam yolla gedərkən bərk susadı və bir quyuya enib su içdi. Sonra quyudan bayıra çıxdıqda bir itin susuzluqdan ləhlədiyini və yaş torpaq yaladığını görüb

[1] Əvvəldəki hədis.
[2] "Ali-İmran" surəsi, 77.

(öz-özünə): "Mən susadığım kimi, bu (it də) susamışdır"– dedi və (quyuya enib) ayaqqabısını su ilə doldurdu. Sonra ayaqqabısını dişləri ilə tutub quyudan çıxdı və itə su verdi. Allah da ona (bunun) əvəzini verdi və onu bağışladı." (Əshabələr) dedilər: "Ey Allahın elçisi, məgər heyvanlara (etdiyimiz yaxşılıqlara) görə də bizə savab yazılır?" O buyurdu: "Hər bir canlıya (göstərdiyin qayğıya) görə savab vardır." (əl-Buxari, 2363)

## 6-cı fəsil. Hovuz və ya cürdək[1] sahibinin suya hamıdan çox haqqı olduğunu deyən kimsə

## ٦– باب: مَنْ رَأَى أَنَّ صَاحِبَ الْحَوْضِ وَالْقِرْبَةِ أَحَقُّ بِمَائِهِ

١٠٩٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «وَالَّذِي نَفْسِي بِيَدِهِ لأَذُودَنَّ رِجَالاً عَنْ حَوْضِي كَمَا تُذَادُ الْغَرِيبَةُ مِنَ الإِبِلِ عَنِ الْحَوْضِ». [رواه البخاري: ٢٣٦٧]

**1093.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Canım Əlində olan Allaha and olsun ki, yad dəvələr su hövzəsinin kənarından qovulduğu kimi mən də bir çox adamları öz hovuzumun ətrafından qovacağam.[2]" (əl-Buxari, 2367)

١٠٩٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمُ اللَّهُ يَوْمَ الْقِيَامَة، وَلاَ يَنْظُرُ إِلَيْهِمْ رَجُلٌ حَلَفَ عَلَى سِلْعَة لَقَدْ أُعْطِيَ بِهَا أَكْثَرَ مِمَّا أَعْطَى وَهُوَ كَاذِبٌ، وَرَجُلٌ حَلَفَ عَلَى يَمِينٍ كَاذِبَة بَعْدَ الْعَصْرِ لِيَقْتَطِعَ بِهَا مَالَ رَجُلٍ مُسْلِمٍ، وَرَجُلٌ مَنَعَ فَضْلَ مَاءٍ، فَيَقُولُ اللَّهُ الْيَوْمَ أَمْنَعُكَ فَضْلِي، كَمَا مَنَعْتَ فَضْلَ مَا لَمْ تَعْمَلْ يَدَاكَ». [رواه البخاري: ٢٣٦٩]

**1094.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç qisim insan vardır ki, Qiyamət günü Allah onları danışdırmayacaq və üzlərinə baxmayacaqdır:

– (müştəriyə) yalandan and içib, (guya) satdığı mala onun verdiyi puldan daha çox pul verildiyini deyən kimsə;

– axşamçağı (bayıra çıxıb) bir müsəlmanın malını mənimsəmək məqsədilə yalandan and içən kimsə;

– (cürdəyində qalmış) artıq sudan başqalarına verməyən kimsə. (Beləsinə) Allah buyuracaq: "Sən əllərinlə yaratmadığın bir şeyin artığını (başqasından) əsirgədiyin kimi, bu gün də Mən Öz mərhəmətimi səndən əsirgəyəcəyəm!" (əl-Buxari, 2369)

## 7-ci fəsil. Qoruqlar ancaq Allaha və Onun elçisinə ﷺ aiddir

## ٧– باب: لاَ حِمَى إِلاَّ لِلَّهِ وَلِرَسُولِهِ ﷺ

١٠٩٥ – عَنْ الصَّعْبِ بْنِ جَثَّامَةَ ﷺ قَالَ إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ حِمَى إِلاَّ لِلَّهِ وَلِرَسُولِهِ ﷺ». [رواه البخاري: ٢٣٧٠]

[1] Gildən, saxsıdan, şüşədən və s. materialdan hazırlanmış dar boğazlı su qabı.

[2] Qiyamət günü Peyğəmbər ﷺ öz hovuzunun kənarında oturmağa layiq olmayan insanları oradan qovacaqdır.

**1095.** Sab ibn Cəssamə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qoruqlar ancaq Allaha və Onun elçisinə ﷺ aiddir.[1]" (əl-Buxari, 2370)

## ٨– باب: شُرْبُ النَّاسِ وَالدَّوَابِّ مِنَ الأَنْهَارِ

## 8-ci fəsil. İnsanların çaydan su içməsi və öz heyvanlarını suvarması

١٠٩٦ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «الْخَيْلُ لِرَجُلٍ أَجْرٌ، وَلِرَجُلٍ سِتْرٌ، وَعَلَى رَجُلٍ وِزْرٌ، فَأَمَّا الَّذِى لَهُ أَجْرٌ فَرَجُلٌ رَبَطَهَا فِى سَبِيلِ اللَّهِ، فَأَطَالَ بِهَا فِى مَرْجٍ أَوْ رَوْضَةٍ، فَمَا أَصَابَتْ فِى طِيَلِهَا ذَلِكَ مِنَ الْمَرْجِ أَوِ الرَّوْضَةِ كَانَتْ لَهُ حَسَنَاتٍ، وَلَوْ أَنَّهُ انْقَطَعَ طِيَلُهَا فَاسْتَنَّتْ شَرَفًا أَوْ شَرَفَيْنِ كَانَتْ آثَارُهَا وَأَرْوَاثُهَا حَسَنَاتٍ لَهُ، وَلَوْ أَنَّهَا مَرَّتْ بِنَهَرٍ فَشَرِبَتْ مِنْهُ وَلَمْ يُرِدْ أَنْ يَسْقِىَ كَانَ ذَلِكَ حَسَنَاتٍ لَهُ، فَهِىَ لِذَلِكَ أَجْرٌ، وَرَجُلٌ رَبَطَهَا تَغَنِّيًا وَتَعَفُّفًا ثُمَّ لَمْ يَنْسَ حَقَّ اللَّهِ فِى رِقَابِهَا وَلاَ ظُهُورِهَا، فَهِىَ لِذَلِكَ سِتْرٌ، وَرَجُلٌ رَبَطَهَا فَخْرًا وَرِيَاءً وَنِوَاءً لأَهْلِ الإِسْلاَمِ، فَهِىَ عَلَى ذَلِكَ وِزْرٌ». وَسُئِلَ رَسُولُ اللَّهِ ﷺ عَنِ الْحُمُرِ فَقَالَ: «مَا أُنْزِلَ عَلَىَّ فِيهَا شَىْءٌ إِلاَّ هَذِهِ الآيَةُ الْجَامِعَةُ الْفَاذَّةُ: ﴿ فَمَن يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ خَيْرًا يَرَهُۥ ۝ وَمَن يَعْمَلْ مِثْقَالَ ذَرَّةٍ شَرًّا يَرَهُۥ ﴾. [رواه البخاري: ٢٣٧١]

**1096.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "At (saxlamaq), kimisinə savab qazandırar, kimisinin (kasıbçılığını) ört-basdır edər, kimisinə də günah qazandırar.

Savab qazanan adama gəlincə, bu o kimsədir ki, atını otlaqda və ya bağ-bağatlı yerdə uzun kəndirlə bağlayıb Allah yolunda (döyüşmək üçün) saxlamışdır. At otlaqda və ya bağçada otladığı müddət ərzində ona savab yazılar. Hərgah atın kəndiri qırılarsa və at qaçıb bir, yaxud iki təpə aşarsa, onun qoyduğu ləpirlərə və (ifraz etdiyi) nəcisinə görə (yiyəsinə) savab yazılar; və əgər bir çaydan keçib ondan su içərsə, yiyəsinin onu sulamaq istəyi olmasa belə, buna görə ona savab yazılar. Beləliklə də, bu at ona savab qazandırar.

Digəri isə, atını, insanlara möhtac olmasın və dilənməsin deyə (qazanc məqsədilə) saxlayan, üstəlik onu bəslədikdə Allahın haqqını unutmayan kimsədir. Bu at onun üçün örtük olar.

(Üçüncüsü isə,) atını, lovğalıq etmək, özünü göstərmək və ya onu müsəlmanların əleyhinə istifadə etmək məqsədilə saxlayan kimsədir. Bu at ona günah qazandırar."

Peyğəmbərdən ﷺ eşşəklər barədə soruşdular. O buyurdu: "Bu xüsusda hər şeyi əhatə edən, müstəsna sayılan bu ayələrdən başqa mənə bir ayə nazil olmamışdır: "Zərrə qədər yaxşılıq edən *əvəzini* alacaqdır. Zərrə qədər pislik edən də *əvəzini* alacaqdır."[2] (əl-Buxari, 2371)

## ٩– باب: بَيْعُ الْحَطَبِ وَالْكَلإِ

## 9-cu fəsil. Odunun və alafın[3] satışı

١٠٩٧ – عَنْ عَلِىِّ بْنِ أَبِى طَالِبٍ ﷺ أَنَّهُ قَالَ: أَصَبْتُ شَارِفًا مَعَ رَسُولِ اللَّهِ ﷺ فِى مَغْنَمٍ يَوْمَ بَدْرٍ قَالَ وَأَعْطَانِى رَسُولُ اللَّهِ ﷺ شَارِفًا أُخْرَى، فَأَنَخْتُهُمَا يَوْمًا عِنْدَ بَابِ رَجُلٍ مِنَ الأَنْصَارِ، وَأَنَا أُرِيدُ أَنْ أَحْمِلَ عَلَيْهِمَا إِذْخِرًا لأَبِيعَهُ،

---

[1] Bununla şəriət müsəlman əmirlərinə məsləhət bildikləri yerlərdə sərhəd çəkməyə izn vermişdir.

[2] "əz-Zəlzələ" surəsi, 7-8.

[3] Ot, saman, küləş və s.

وَمَعِى صَائِغٌ مِنْ بَنِى قَيْنُقَاعَ فَأَسْتَعِينَ بِهِ عَلَى وَلِيمَةِ فَاطِمَةَ، وَحَمْزَةُ بْنُ عَبْدِ الْمُطَّلِبِ يَشْرَبُ فِى ذَلِكَ الْبَيْتِ مَعَهُ قَيْنَةٌ، فَقَالَتْ أَلاَ يَا حَمْزَ لِلشُّرُفِ النِّوَاءِ. فَثَارَ إِلَيْهِمَا حَمْزَةُ بِالسَّيْفِ، فَجَبَّ أَسْنِمَتَهُمَا، وَبَقَرَ خَوَاصِرَهُمَا، ثُمَّ أَخَذَ مِنْ أَكْبَادِهِمَا. قُلْتُ لاِبْنِ شِهَابٍ وَمِنَ السَّنَامِ قَالَ قَدْ جَبَّ أَسْنِمَتَهُمَا فَذَهَبَ بِهَا. قَالَ ابْنُ شِهَابٍ قَالَ عَلِىٌّ ؓ فَنَظَرْتُ إِلَى مَنْظَرٍ أَفْظَعَنِى فَأَتَيْتُ نَبِىَّ اللَّهِ ﷺ وَعِنْدَهُ زَيْدُ بْنُ حَارِثَةَ فَأَخْبَرْتُهُ الْخَبَرَ فَخَرَجَ وَمَعَهُ زَيْدٌ، فَانْطَلَقْتُ مَعَهُ، فَدَخَلَ عَلَى حَمْزَةَ فَتَغَيَّظَ عَلَيْهِ فَرَفَعَ حَمْزَةُ بَصَرَهُ وَقَالَ هَلْ أَنْتُمْ إِلاَّ عَبِيدٌ لآبَائِى فَرَجَعَ رَسُولُ اللَّهِ ﷺ يُقَهْقِرُ حَتَّى خَرَجَ عَنْهُمْ، وَذَلِكَ قَبْلَ تَحْرِيمِ الْخَمْرِ. [رواه البخاري: ٢٣٧٥]

**1097.** Rəvayət edilir ki, Əli ibn Əbu Talib ؓ demişdir: "Peyğəmbərlə ﷺ birlikdə iştirak etdiyim Bədr döyüşündə əldə edilmiş qənimətlərdən mənə yaşlı bir dəvə çatdı. Bundan başqa Peyğəmbər ﷺ mənə bir ədəd də yaşlı dəvə verdi. Bir dəfə mən bu dəvələri ənsardan olan bir əshabənin qapısının yanında yerə çökdürdüm ki, onlara ətirli qamış yükləyim. Belə etmək istəyirdim ki, (qamışları) satıb Fatimənin toyu üçün bir qədər pul əldə edim. Bəni Qəynuqa qəbiləsindən olan zərgər də mənim yanımda idi. Həmin vaxt Həmzə ibn Abdul-Muttəlib bu evdə müğənni bir qadınla (şərab) içirdi. (Bu dəmdə qadın): "Ey Həmzə, bu yaşlı dəvələrə bir bax!"- deyə (şeir) oxudu. Həmzə qılıncını götürdü və dəvələrə yaxınlaşıb onların hürgüclərini kəsdi, habelə böyürlərini yarıb ciyərlərindən bir qədər götürdü."

(Hədisin ravilərindən biri dedi): "Mən ibn Şihabdan soruşdum: "O, dəvənin hürgücündən də götürdü?" İbn Şihab dedi: "O, hər iki dəvənin hürgüclərini kəsib apardı."

Əli ibn Əbu Talib ؓ dedi: "Mən bu mənzərəni gördükdə dəhşətə gəldim və dərhal Peyğəmbərin ﷺ yanına gəlib başıma gələnləri ona danışdım. Bu vaxt Zeyd ibn Harisə də onun yanında idi. Peyğəmbər ﷺ, Zeyd və mən oraya getdik. Peyğəmbər ﷺ Həmzənin (olduğu evə) daxil olub qəzəbli halda (onu danlamağa başladı). Həmzə ona baxıb dedi: "Məgər siz mənim əcdadlarımın köləları deyilsinizmi?" Belə olduqda Peyğəmbər ﷺ daldalı çəkildi və onları tərk edib getdi. Bütün bunlar şərab haram buyrulmamışdan əvvəl baş vermişdi. (əl-Buxari, 2375)

## ١٠- باب: الْقَطَائِعُ

## 10-cu fəsil. Xam torpaqdan pay ayrımaq

١٠٩٨ - عَنْ أَنَسٍ ؓ قَالَ: أَرَادَ النَّبِىُّ ﷺ أَنْ يُقْطِعَ مِنَ الْبَحْرَيْنِ، فَقَالَتِ الأَنْصَارُ حَتَّى تُقْطِعَ لإِخْوَانِنَا مِنَ الْمُهَاجِرِينَ مِثْلَ الَّذِى تُقْطِعُ لَنَا قَالَ: «سَتَرَوْنَ بَعْدِى أَثَرَةً فَاصْبِرُوا حَتَّى تَلْقَوْنِى». [رواه البخاري: ٢٣٧٦]

**1098.** Rəvayət edilir ki, Ənəs ؓ demişdir: "Peyğəmbər ﷺ Bəhreyn torpaqlarının bir qismini (ənsar üçün) təxsis etmək istədikdə ənsar dedi: "Bizim üçün təxsis etdiyin (torpaqların) eynisini mühacir qardaşlarımız üçün təxsis etməyincə biz (o əraziləri) qəbul etməyəcəyik." Peyğəmbər ﷺ buyurdu: "Mən (sizin aranızdan getdikdən) sonra (qənimətləri paylayan kəslərin digər insanları, sizdən) üstün tutacaqlarını görəcəksiniz. (Hovuzumun başında) mənimlə görüşənədək səbir edin!" (əl-Buxari, 2376)

## 11-ci fəsil.
## Adamın (başqasına məxsus) bağça və ya xurmalıqdan keçmək və ya sulama haqqı ola bilər

## ١١– باب:
## الرَّجُلُ يَكُونُ لَهُ مَمَرٌّ، أَوْ شِرْبٌ فِى حَائِطٍ أَوْ فِى نَخْلٍ

١٠٩٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «مَنِ ابْتَاعَ نَخْلاً بَعْدَ أَنْ تُؤَبَّرَ فَثَمَرَتُهَا لِلْبَائِعِ، إِلاَّ أَنْ يَشْتَرِطَ الْمُبْتَاعُ، وَمَنِ ابْتَاعَ عَبْدًا وَلَهُ مَالٌ فَمَالُهُ لِلَّذِى بَاعَهُ إِلاَّ أَنْ يَشْتَرِطَ الْمُبْتَاعُ». [رواه البخاري: ٢٣٧٩]

**1099.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim xurma ağaclarını, onlar tozlandıqdan sonra alarsa, onların meyvələri[1] satan adama çatar. Yalnız müştərinin şərt kəsməsi istisnadır. Kim bir kölə alarsa, onun malı satan adama çatar. Yalnız müştərinin şərt kəsməsi istisnadır.[2]" (əl-Buxari, 2379)

---

[1] Ancaq həmin tozlanmadan əmələ gəlmiş xurmalar nəzərdə tutulur.

[2] Əgər bu sövdələşmələrdə müştəri şərt kəssə ki, ağacın verəcəyi məhsul və ya kölənin sahib olduğu mal ona çatmalıdır, onda məhsul da, malı da müştəriyə qalmalıdır.

# ٤٤ – كِتَابٌ فِي الاسْتِقْرَاضِ وَ أَدَاءِ الدُّيُونِ وَ الحَجْرِ وَ التَّفْلِيسِ

# 44 – Borc almaq, borcu qaytarmaq, əmlakın həbs olunması[1] və iflasa uğramaq kitabı

## ١ – باب: مَنْ أَخَذَ أَمْوَالَ النَّاسِ يُرِيدُ أَدَاءَهَا أَوْ إِتْلافَهَا

## 1-ci fəsil. İnsanların malını, onu qaytarmaq və ya dağıtmaq niyyəti ilə almaq

١١٠٠ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ أَخَذَ أَمْوَالَ النَّاسِ يُرِيدُ أَدَاءَهَا أَدَّى اللَّهُ عَنْهُ، وَمَنْ أَخَذَ يُرِيدُ إِتْلاَفَهَا أَتْلَفَهُ اللَّهُ». [رواه البخاري: ٢٣٨٧]

**1100.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanların malını qaytarmaq niyyəti ilə götürən kimsənin (borcunu) onun əvəzinə Allah qaytarar[2], (onu) tələf etmək (və qaytarmamaq) niyyəti ilə götürən kimsəni isə Allah məhv edər." (əl-Buxari, 2387)

## ٢ – باب: أَدَاءُ الدُّيُونِ، وَ قَالَ اللَّهُ تَعَالَى: ﴿إِنَّ اللَّهَ يَأْمُرُكُمْ أَنْ تُؤَدُّوا الأَمَانَاتِ إِلَى أَهْلِهَا وَإِذَا حَكَمْتُمْ بَيْنَ النَّاسِ أَنْ تَحْكُمُوا بِالْعَدْلِ...﴾

## 2-ci fəsil. Borcların ödənilməsi. Uca Allah buyurur: "Həqiqətən, Allah sizə əmanətləri sahiblərinə qaytarmanızı və insanlar arasında hökm verərkən ədalətlə hökm verməyinizi əmr edir."[3]

١١٠١ – عَنْ أَبِى ذَرٍّ ﷺ قَالَ: كُنْتُ مَعَ النَّبِيِّ ﷺ فَلَمَّا أَبْصَرَ – يَعْنِى أُحُدًا – قَالَ: «مَا أُحِبُّ أَنَّهُ يُحَوَّلُ لِى ذَهَبًا يَمْكُثُ عِنْدِى مِنْهُ دِينَارٌ فَوْقَ ثَلاَثٍ، إِلاَّ دِينَارًا أُرْصِدُهُ لِدَيْنٍ». ثُمَّ قَالَ: «إِنَّ الأَكْثَرِينَ هُمُ الأَقَلُّونَ، إِلاَّ مَنْ قَالَ بِالْمَالِ هَكَذَا وَهَكَذَا». وَأَشَارَ أَبُو شِهَابٍ بَيْنَ يَدَيْهِ وَعَنْ يَمِينِهِ وَعَنْ شِمَالِهِ – وَقَلِيلٌ مَا هُمْ – وَقَالَ مَكَانَكَ. وَتَقَدَّمَ غَيْرَ بَعِيدٍ، فَسَمِعْتُ صَوْتًا، فَأَرَدْتُ أَنْ آتِيَهُ، ثُمَّ ذَكَرْتُ قَوْلَهُ مَكَانَكَ حَتَّى آتِيَكَ، فَلَمَّا جَاءَ قُلْتُ يَا رَسُولَ اللَّهِ، الَّذِى سَمِعْتُ أَوْ قَالَ الصَّوْتُ الَّذِى سَمِعْتُ قَالَ: «وَهَلْ سَمِعْتَ؟» قُلْتُ نَعَمْ. قَالَ: «أَتَانِى جِبْرِيلُ فَقَالَ مَنْ مَاتَ مِنْ أُمَّتِكَ لاَ يُشْرِكُ بِاللَّهِ شَيْئًا دَخَلَ الْجَنَّةَ». قُلْتُ وَإِنْ فَعَلَ كَذَا وَكَذَا قَالَ: «نَعَمْ». [رواه البخاري: ٢٣٨٨]

**1101.** Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərin ﷺ yanında ikən o, Uhud dağına baxıb dedi: "Mən istəməzdim ki, bu dağ mənim üçün qızıla çevrilsin və mən bu qızıllardan bir dinar belə üç gündən artıq özümdə saxlayım. Yalnız borcumu ödəmək üçün saxlayacağım dinardan

---

[1] Mülkdən, maldan və s.-dən istifadə edilməsinin məhkəmə orqanları tərəfindən qadağan olunması.

[2] Yəni götürdüyü borcu qaytarmağa kömək edər.

[3] "ən-Nisa" surəsi, 58.

başqa." Sonra əlavə edib dedi: "(Mal-dövləti) çox olanların (savabı) az olacaq. Malını bu cür və bu cür[1] xərcləyənlər isə istisnadır. (Hədisi nəql edən ibn Şihab bunu deyəndə əlləri ilə önünə, sağına və soluna işarə etdi.) Onların sayı isə çox azdır." Sonra o mənə: "(Mən sənin yanına gələnədək) yerində qal!"- deyə buyurdu və bir qədər irəli getdi. Sonra mən bir səs eşitdim və onun yanına getmək istədim. Lakin onun mənə dediyi: "Mən sənin yanına gələnədək yerində qal!"– sözü yadıma düşdü (və mən yerimdən tərpənmədim). O geri qayıtdıqda mən soruşdum: "Ya Rəsulullah, eşitdiyim o səs (nə idi)?" Peyğəmbər ﷺ soruşdu: "Doğrudan sən eşitdin?" Mən: "Bəli!"– deyə cavab verdim. Peyğəmbər ﷺ dedi: "(Bu,) Cəbrail idi, mənim yanıma gəlib dedi ki: "Ümmətindən Allaha heç bir şeyi şərik qoşmadan ölən hər kəs Cənnətə girəcək!"

Mən dedim: "Filan və filan işləri[2] görsə belə?" Peyğəmbər ﷺ: "Bəli!"- dedi." (əl-Buxari, 2388)

## 3-cü fəsil. Borcu gözəl tərzdə ödəmək

## ٣– باب: حُسْنُ الْقَضَاءِ

١١٠٢ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّه رضي الله عنهما قَالَ أَتَيْتُ النَّبِىَّ ﷺ وَهُوَ فِى الْمَسْجِدِ – قَالَ مِسْعَرٌ أُرَاهُ قَالَ ضُحًى – فَقَالَ: «صَلِّ رَكْعَتَيْنِ». وَكَانَ لِى عَلَيْهِ دَيْنٌ فَقَضَانِى وَزَادَنِى. [رواه البخاري: ٢٣٩٤]

**1102.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ məsciddə ikən mən onun yanına getdim. (Hədisi rəvayət edən Misar: "Deyəsən, o, səhər-səhər[3] getdiyini xəbər vermişdir"– dedi.) Peyğəmbər ﷺ mənə: "İki rükət namaz qıl!"– deyə buyurdu. Həmin vaxt onun mənə borcu var idi. O, borcunu qaytardı, üstəlik bir qədər də əlavə etdi[4]". (əl-Buxari, 2394)

## 4-cü fəsil. Borcu olduğu halda ölən kimsənin cənazə namazı

## ٤– باب: الصَّلاَةُ عَلَى مَنْ تَرَكَ دَيْنًا

١١٠٣ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ النَّبِىَّ ﷺ قَالَ: «مَا مِنْ مُؤْمِنٍ إِلاَّ وَأَنَا أَوْلَى بِهِ فِى الدُّنْيَا وَالآخِرَةِ اقْرَءُوا إِنْ شِئْتُمْ: ﴿ٱلنَّبِىُّ أَوْلَىٰ بِٱلْمُؤْمِنِينَ مِنْ أَنفُسِهِمْ﴾ فَأَيُّمَا مُؤْمِنٍ مَاتَ وَتَرَكَ مَالاً فَلْيَرِثْهُ عَصَبَتُهُ مَنْ كَانُوا، وَمَنْ تَرَكَ دَيْنًا أَوْ ضَيَاعًا فَلْيَأْتِنِى فَأَنَا مَوْلاَهُ». [رواه البخاري: ٢٣٩٩]

[1] Burada mal-dövlətini səmimi qəlbdən Allah yolunda xərcləyənlər nəzərdə tutulur.

[2] 633-cü hədisə bax.

[3] Burada səhər deyildikdə duha vaxtı nəzərdə tutulur.

[4] Peyğəmbər ﷺ bunu ona yaxşılıq etmək məqsədilə vermişdir. Burada sələmdən söhbət gedə bilməz. Çünki Allah və Onun Peyğəmbəri ﷺ sələm verməyi də, almağı da haram buyurmuşdur. Bax: "əl-Bəqərə", 275, 276 və 278; "Ali-İmran", 130; "ən-Nisa", 161; "ər-Rum", 39; üstəlik yuxarıda nəql edilmiş 697-ci və 997-ci hədislərə bax. Abdul-Muhsin Abbad demişdir: "İnsanlar aldıqları borcu qaytardıqda üstündə əlavə olaraq (hədiyyə) verməyə özlərini öyrəşdirsələr bu riba sayılar."

**1103.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Elə bir mömin yoxdur ki, mən ona həm bu dünyada, həm də axirətdə hamıdan yaxın olmayım. İstəyirsinizsə, bu ayəni oxuyun: **"Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır"**[1]. Odur ki, hansı bir mömin vəfat etmiş və (özündən sonra) mal-dövlət qoyub getmişdirsə, qoy bu mal-dövlət onun ata tərəfdən olan varislərinə çatsın. Kimin borcu və ya yetim uşaqları qalmışdırsa, qoy mənim yanıma gəlsinlər[2]. Çünki onun hamisi mənəm!" (əl-Buxari, 2399)

## ٥- باب: مَا يُنْهَى عَنْ إِضَاعَةِ الْمَالِ، قَالَ اللَّهُ تَعَالَى: ﴿وَاللَّهُ لاَ يُحِبُّ الْفَسَادَ﴾ وَ قَالَ: ﴿وَلاَ تُؤْتُوا السُّفَهَاءَ أَمْوَالَكُمْ﴾

## 5-ci fəsil. Malı israf etməyin qadağan olunması. Uca Allah buyurur: "Allah fitnə-fəsadı sevmir."[3] Həmçinin buyurur: "...mallarınızı ağılsızlara verməyin."[4]

١١٠٤ – عَنْ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «إِنَّ اللَّهَ حَرَّمَ عَلَيْكُمْ عُقُوقَ الأُمَّهَاتِ، وَوَأْدَ الْبَنَاتِ، وَمَنَعَ وَهَاتِ، وَكَرِهَ لَكُمْ قِيلَ وَقَالَ، وَكَثْرَةَ السُّؤَالِ، وَإِضَاعَةَ الْمَالِ». [رواه البخاري: ٢٤٠٨]

**1104.** Muğira ibn Şobə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Allah sizlərə anaların üzünə ağ olmağı, qız uşaqlarını diri-diri yerə gömməyi, (borcu qaytarmaqdan) boyun qaçırmağı və "ver"– deyərək (haqqınız olmayan bir şeyi) tələb etməyi qadağan etmişdir. Habelə söz gəzdirməyinizi, çox sual verməyinizi və var-dövləti israf etməyinizi xoşlamır." (əl-Buxari, 2408)

---

[1] "əl-Əhzab" surəsi, 6.
[2] Söhbət borc yiyələrindən və yetimlərdən gedir.
[3] "əl-Bəqərə" surəsi, 205.
[4] "ən-Nisa" surəsi, 5.

# ٤٥ – كِتَابُ الْخُصُومَاتِ

# 45 – İddia[1] kitabı

## ١ – باب: مَا يُذْكَرُ فِي الإِشْخَاصِ وَالْخُصُومَةِ بَيْنَ الْمُسْلِمِ وَالْيَهُودِ

## 1-ci fəsil. İddiaçıların məhkəməyə çağırılması və müsəlmanla yəhudinin çəkişməsi

١١٠٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: سَمِعْتُ رَجُلاً قَرَأَ آيَةً سَمِعْتُ مِنَ النَّبِيِّ ﷺ خِلاَفَهَا، فَأَخَذْتُ بِيَدِهِ، فَأَتَيْتُ بِهِ رَسُولَ اللَّهِ ﷺ فَقَالَ: «كِلاَكُمَا مُحْسِنٌ، لاَ تَخْتَلِفُوا فَإِنَّ مَنْ كَانَ قَبْلَكُمُ اخْتَلَفُوا فَهَلَكُوا». [رواه البخاري: ٢٤١٠]

**1105.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Mən bir adamın ayəni Peyğəmbərin ﷺ oxuduğu kimi oxumadığını eşitdim. Onda mən onun əlindən tutub Peyğəmbərin ﷺ yanına apardım. Peyğəmbər ﷺ buyurdu: "İkiniz də düz oxuyursunuz. İxtilaf etməyin! Həqiqətən, sizdən əvvəlkilər ixtilaf etmiş, (bu səbəbdən də) həlak olmuşlar." (əl-Buxari, 2410)

١١٠٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: اسْتَبَّ رَجُلاَنِ رَجُلٌ مِنَ الْمُسْلِمِينَ وَرَجُلٌ مِنَ الْيَهُودِ، قَالَ الْمُسْلِمُ وَالَّذِي اصْطَفَى مُحَمَّدًا عَلَى الْعَالَمِينَ، فَقَالَ الْيَهُودِيُّ وَالَّذِي اصْطَفَى مُوسَى عَلَى الْعَالَمِينَ. فَرَفَعَ الْمُسْلِمُ يَدَهُ عِنْدَ ذَلِكَ فَلَطَمَ وَجْهَ الْيَهُودِيِّ، فَذَهَبَ الْيَهُودِيُّ إِلَى النَّبِيِّ ﷺ فَأَخْبَرَهُ بِمَا كَانَ مِنْ أَمْرِهِ وَأَمْرِ الْمُسْلِمِ، فَدَعَا النَّبِيُّ ﷺ الْمُسْلِمَ فَسَأَلَهُ عَنْ ذَلِكَ، فَأَخْبَرَهُ فَقَالَ النَّبِيُّ ﷺ: «لاَ تُخَيِّرُونِي عَلَى مُوسَى، فَإِنَّ النَّاسَ يَصْعَقُونَ يَوْمَ الْقِيَامَةِ، فَأَصْعَقُ مَعَهُمْ، فَأَكُونُ أَوَّلَ مَنْ يُفِيقُ، فَإِذَا مُوسَى بَاطِشٌ جَانِبَ الْعَرْشِ، فَلاَ أَدْرِي أَكَانَ فِيمَنْ صَعِقَ فَأَفَاقَ قَبْلِي، أَوْ كَانَ مِمَّنِ اسْتَثْنَى اللَّهُ». [رواه البخاري: ٢٤١١]

**1106.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "(Bir dəfə) bir müsəlmanla bir yəhudi bir-birilərini söyməyə başladılar. Bu əsnada müsəlman dedi: "Aləmlər içində Muhəmmədi üstün edən Allaha and olsun ki..." Yəhudi (isə cavabında belə) dedi: "Aləmlər içində Musanı üstün edən Allaha and olsun ki..." (Bunu eşidəndə) müsəlman əlini qaldırıb onun üzünə bir yumruq vurdu. Bundan sonra yəhudi Peyğəmbərin ﷺ yanına gedib müsəlmanla onun arasında baş verənləri ona danışdı. Onda Peyğəmbər ﷺ müsəlmanı çağırıb baş vermiş hadisə barəsində ondan soruşdu, o da hər şeyi (olduğu kimi) ona danışdı. Peyğəmbər ﷺ buyurdu: "Məni Musadan üstün tutmayın! Həqiqətən, Qiyamət günü bütün insanlar bayılacaq, mən də onlarla birlikdə bayılacağam. Sonra ilk ayılan mən olacağam. (Ayıldıqda) görəcəyəm ki, Musa (Allahın) Ərşinin bir qırağından tutub. Mən bilmirəm, o, hamı ilə birlikdə bayıldıqdan sonra məndən qabaq ayılacaq, yoxsa Allah onu müstəsna kimsələrdən[2] edəcəkdir." (əl-Buxari, 2411)

---

[1] Haqlı-haqsız bir fikrin üstündə inad etmək, bir şeyi başqalarına da qəbul etdirməyə çalışmaq, özünə istinad etdiyi bir keyfiyyətin, sifətin başqaları tərəfindən də qəbul və təsdiqinə çalışma, özü haqqında böyük fikirdə olma.

[2] Bax: "əz-Zumər", 68.

١١٠٧ – عَنْ أَنَسٍ ﷺ أَنَّ يَهُودِيًّا رَضَّ رَأْسَ جَارِيَةٍ بَيْنَ حَجَرَيْنِ، قِيلَ مَنْ فَعَلَ هَذَا بِكِ أَفُلاَنٌ، أَفُلاَنٌ حَتَّى سُمِّيَ الْيَهُودِيُّ فَأَوْمَتْ بِرَأْسِهَا، فَأُخِذَ الْيَهُودِيُّ فَاعْتَرَفَ، فَأَمَرَ بِهِ النَّبِيُّ ﷺ فَرُضَّ رَأْسُهُ بَيْنَ حَجَرَيْنِ. [رواه البخاري: ٢٤١٣]

**1107.** Ənəs ﷺ rəvayət etmişdir ki, (bir dəfə) bir yəhudi bir qızın başını iki daşın arasında qoyub əzdi. Qızdan: "Səni kim bu kökə salıb, filankəsmi, yoxsa filankəsmi?"– deyə soruşdular. Nəhayət, yəhudinin adı çəkildikdə qız başı ilə işarə etdi. Dərhal yəhudini tutub gətirdilər və (o öz əməlini) etiraf etdi. Bundan sonra Peyğəmbərin ﷺ əmri ilə onun başını iki daşını arasına qoyub əzdilər." (əl-Buxari, 2413)

## 2-ci fəsil. İddiaçıların bir-birilərinin əleyhinə dediyi sözlər

## ٢ – باب: كَلاَمُ الْخُصُومِ بَعْضِهِمْ فِي بَعْضٍ

١١٠٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ حَلَفَ عَلَى يَمِينٍ وَهُوَ فِيهَا فَاجِرٌ لِيَقْتَطِعَ بِهَا مَالَ امْرِئٍ مُسْلِمٍ لَقِيَ اللَّهَ وَهُوَ عَلَيْهِ غَضْبَانُ».
فَقَالَ الأَشْعَثُ فِيَّ وَاللَّهِ كَانَ ذَلِكَ، كَانَ بَيْنِي وَبَيْنَ رَجُلٍ مِنَ الْيَهُودِ أَرْضٌ فَجَحَدَنِي، فَقَدَّمْتُهُ إِلَى النَّبِيِّ ﷺ فَقَالَ لِي رَسُولُ اللَّهِ ﷺ: «أَلَكَ بَيِّنَةٌ». قُلْتُ لاَ. قَالَ فَقَالَ لِلْيَهُودِيِّ: «احْلِفْ». قَالَ قُلْتُ يَا رَسُولَ اللَّهِ إِذًا يَحْلِفَ، وَيَذْهَبَ بِمَالِي، فَأَنْزَلَ اللَّهُ تَعَالَى: ( إِنَّ الَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ اللَّهِ وَأَيْمَانِهِمْ ثَمَنًا قَلِيلاً ) إِلَى آخِرِ الآيَةِ. [رواه البخاري: ٢٤١٦-٢٤١٧]

**1108.** Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bir müsəlmanın malını mənimsəmək məqsədilə yalandan and içərsə, Allahın hüzuruna gələcəyi gün Allahın ona qəzəbi tutar."

(Bunu eşidən) Əşəs ibn Qeys ﷺ dedi: "Vallahi, bu hadisə[1] mənimlə bağlıdır. Belə ki, mənimlə bir yəhudinin arasına torpaq məsələsində mübahisə düşdü və o, (torpağın, mənim olduğumu) inkar etdi. Mən bu məsələni Peyğəmbərə ﷺ ərz etdikdə Peyğəmbər ﷺ məndən: "Dəlil-sübutun varmı?"– deyə soruşdu. Mən: "Xeyr!"– deyə cavab verdim. Peyğəmbər ﷺ yəhudiyə: "And iç!"– deyə buyurdu. Mən dedim: "Ya Rəsulullah, o, (yalandan) and içib mənim malımı mənimsəyəcək." Bu vaxt Uca Allah (bu ayəni) nazil etdi: "Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur. Qiyamət günü Allah onları danışdırmayacaq, onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Onlar üçün ağrılı-acılı bir əzab vardır"[2]. (əl-Buxari, 2416-2417)

[1] 1090-cı hədisə bax.
[2] "Ali-İmran" surəsi, 77.

# ٤٦ – كِتَابٌ فِي اللُّقَطَةِ

# 46 – Tapılmış şey kitabı

## ١ – باب: إِذَا أَخْبَرَهُ صَاحِبُ اللُّقَطَةِ بِالْعَلَامَةِ دَفَعَ إِلَيْهِ

## 1-ci fəsil. Tapılmış malın yiyəsi onun əlamətlərini desə, onu yiyəsinə qaytarmaq gərəkdir

١١٠٩ – عَنْ أُبَيِّ بْنِ كَعْبٍ ﷺ قَالَ: أَخَذْتُ صُرَّةً مِائَةَ دِينَارٍ فَأَتَيْتُ النَّبِيَّ ﷺ فَقَالَ: «عَرِّفْهَا حَوْلاً». فَعَرَّفْتُهَا حَوْلَهَا فَلَمْ أَجِدْ مَنْ يَعْرِفُهَا، ثُمَّ أَتَيْتُهُ فَقَالَ: «عَرِّفْهَا حَوْلاً» فَعَرَّفْتُهَا فَلَمْ أَجِدْ، ثُمَّ أَتَيْتُهُ ثَلَاثًا فَقَالَ: «احْفَظْ وِعَاءَهَا وَعَدَدَهَا وَوِكَاءَهَا، فَإِنْ جَاءَ صَاحِبُهَا، وَإِلاَّ فَاسْتَمْتِعْ بِهَا». [رواه البخاري: ٢٤٢٦]

**1109.** Rəvayət edilir ki, Ubey ibn Kəb ﷺ demişdir: “Mən içində yüz dinar olan pul kisəsi tapdım və onu Peyğəmbərin ﷺ yanına gətirdim. Peyğəmbər ﷺ: “Bu haqda bir il elan et!”– deyə buyurdu. Mən (belə bir pul kisəsi) tapdığımı bir il elan etdim, lakin onun haqqında məlumatı olan bir kimsə tapa bilmədim. Sonra Peyğəmbərin ﷺ yanına gəldim və o (yenə mənə): “Bu haqda bir il elan et!”– deyə buyurdu. Mən (yenə) bu haqda elan etdim, amma (bir kimsə) tapa bilmədim. Mən üçüncü dəfə Peyğəmbərin ﷺ yanına gəldikdə o buyurdu: “Pul kisəsini və onun bağını (özündə) saxla, (içindəki) pulları say, əgər yiyəsi tapılsa, (kisəni özünə qaytararsan), yox (əgər gəlməzsə), özün ondan istifadə et.” (əl-Buxari, 2426)

## ٢ – باب: إِذَا وَجَدَ تَمْرَةً فِى الطَّرِيقِ

## 2-ci fəsil. Yoldan xurma tapılmışdırsa

١١١٠ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنِّى لأَنْقَلِبُ إِلَى أَهْلِى، فَأَجِدُ التَّمْرَةَ سَاقِطَةً عَلَى فِرَاشِى فَأَرْفَعُهَا لآكُلَهَا، ثُمَّ أَخْشَى أَنْ تَكُونَ صَدَقَةً فَأُلْقِيهَا». [رواه البخاري: ٢٤٣٢]

**1110.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hərdən olur ki, mən evə gəlib yatağımın üstünə düşmüş bir xurma görürəm və onu götürüb yemək istəyirəm. Sonra o xurmanın sədəqə olduğundan ehtiyat edib onu kənara qoyuram.” (əl-Buxari, 2432)

# ٤٧ – كِتَابُ المَظَالِمِ

# 47 – Haqsızlıqla ələ keçirilənlər kitabı

## ١ – باب: قِصَاصُ الْمَظَالِمِ

## 1-ci fəsil. Haqsızlıqlara görə qisas almaq

١١١١ – عَنْ أَبِى سَعِيدٍ الْخُدْرِىِّ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: «إِذَا خَلَصَ الْمُؤْمِنُونَ مِنَ النَّارِ حُبِسُوا بِقَنْطَرَةٍ بَيْنَ الْجَنَّةِ وَالنَّارِ، فَيَتَقَاصُّونَ مَظَالِمَ كَانَتْ بَيْنَهُمْ فِى الدُّنْيَا، حَتَّى إِذَا نُقُّوا وَهُذِّبُوا أُذِنَ لَهُمْ بِدُخُولِ الْجَنَّةِ، فَوَالَّذِى نَفْسُ مُحَمَّدٍ بِيَدِهِ لأَحَدُهُمْ بِمَسْكَنِهِ فِى الْجَنَّةِ أَدَلُّ بِمَنْزِلِهِ كَانَ فِى الدُّنْيَا». [رواه البخاري: ٢٤٤٠]

**1111.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “(Qiyamət günü) möminlər oddan xilas olduqdan[1] sonra Cənnətlə Cəhənnəm arasında (Cənnətə yaxın bir yerdə) dayandırılacaqlar və dünyada (bir-birilərinə qarşı) etdikləri haqsızlıqlara görə bir-birilərinin haqqını ödəyəcəklər. Nəhayət, onlar təmizləndikdən və (günahlardan) azad olduqdan sonra onlara Cənnətə daxil olmağa izn veriləcək. Muhəmmədin canı Əlində olan Allaha and olsun ki, hər biriniz Cənnətdəki yerini dünyadakı mənzilindən daha rahat tapacaq.” (əl-Buxari, 2440)

## ٢ – باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿أَلَا لَعْنَةُ ٱللَّهِ عَلَى ٱلظَّٰلِمِينَ﴾

## 2-ci fəsil. Uca Allahın: “Allahın lənəti olsun zalımlara!”[2] sözü

١١١٢ – عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِنَّ اللَّهَ يُدْنِى الْمُؤْمِنَ فَيَضَعُ عَلَيْهِ كَنَفَهُ، وَيَسْتُرُهُ فَيَقُولُ أَتَعْرِفُ ذَنْبَ كَذَا أَتَعْرِفُ ذَنْبَ كَذَا فَيَقُولُ نَعَمْ أَىْ رَبِّ. حَتَّى إِذَا قَرَّرَهُ بِذُنُوبِهِ وَرَأَى فِى نَفْسِهِ أَنَّهُ هَلَكَ، قَالَ: سَتَرْتُهَا عَلَيْكَ فِى الدُّنْيَا، وَأَنَا أَغْفِرُهَا لَكَ الْيَوْمَ. فَيُعْطَى كِتَابَ حَسَنَاتِهِ، وَأَمَّا الْكَافِرُ وَالْمُنَافِقُونَ فَيَقُولُ الأَشْهَادُ: ﴿هَٰٓؤُلَآءِ ٱلَّذِينَ كَذَبُواْ عَلَىٰ رَبِّهِمْۚ أَلَا لَعْنَةُ ٱللَّهِ عَلَى ٱلظَّٰلِمِينَ﴾. [رواه البخاري: ٢٤٤١]

**1112.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Allah mömini Özünə tərəf yaxınlaşdıracaq, Özü onu əhatə edib qoruyaraq və: “Filan günahı (etdiyini) bilirsənmi? Filan günahı (etdiyini) bilirsənmi?”– deyə soruşacaq. (Mömin): “Bəli, ey Rəbbim!”– deyə cavab verəcək. Nəhayət, Allah ona günahlarını etiraf etdirdikdə və o, öz-özlüyündə həlak olduğunu güman etdikdə Allah buyuracaq: “Dünyada sənin günahlarını ört-basdır etdim və bu gün də Mən sənin günahlarını bağışlayıram.” Sonra ona (içində) yaxşı əməlləri yazılmış bir kitab veriləcək. Kafirə və münafiqlərə gəldikdə isə, (onların əməllərinə) şahid olanlar deyəcəklər: “Bunlar Rəbbinə iftira yaxanlardır”– deyəcəklər. Allahın lənəti olsun zalımlara!” (əl-Buxari, 2441)

---

[1] Yəni Cəhənnəm üzərində qurulmuş körpüdən keçdikdən sonra.

[2] “Hud” surəsi, 18.

## 3-cü fəsil. Müsəlman müsəlmana zülm etməməli və onu (zalıma) təslim verməməlidir

## ٣– باب: لاَ يَظْلِمُ الْمُسْلِمُ الْمُسْلِمَ وَلاَ يُسْلِمُهُ

١١١٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﭭ أَخْبَرَهُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «الْمُسْلِمُ أَخُو الْمُسْلِمِ، لاَ يَظْلِمُهُ وَلاَ يُسْلِمُهُ، وَمَنْ كَانَ فِى حَاجَةِ أَخِيهِ كَانَ اللَّهُ فِى حَاجَتِهِ، وَمَنْ فَرَّجَ عَنْ مُسْلِمٍ كُرْبَةً فَرَّجَ اللَّهُ عَنْهُ كُرْبَةً مِنْ كُرُبَاتِ يَوْمِ الْقِيَامَةِ، وَمَنْ سَتَرَ مُسْلِمًا سَتَرَهُ اللَّهُ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٢٤٤٢]

**1113.** Abdullah ibn Ömər ﭭ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlman müsəlmanın qardaşıdır; ona zülm etməz və onu ələ verməz. Kim qardaşının ehtiyacını ödəyərsə, Allah da onun ehtiyacını ödəyər. Kim bir müsəlmanı bir sıxıntıdan qurtararsa, Allah da onu Qiyamət gününün sıxıntılarının birindən qurtarar. Kim bir müsəlmanın eyblərini örtərsə, Allah da Qiyamət günü onun eyblərini örtər." (əl-Buxari, 2442)

## 4-cü fəsil. İstər zalım, istərsə məzlum olsun, (din) qardaşına yardım et!

## ٤– باب: أَعِنْ أَخَاكَ ظَالِمًا أَوْ مَظْلُومًا

١١١٤ – عَنْ أَنَسٍ ﭬ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «انْصُرْ أَخَاكَ ظَالِمًا أَوْ مَظْلُومًا». قَالُوا يَا رَسُولَ اللَّهِ هَذَا نَنْصُرُهُ مَظْلُومًا، فَكَيْفَ نَنْصُرُهُ ظَالِمًا قَالَ: «تَأْخُذُ فَوْقَ يَدَيْهِ». [رواه البخاري: ٢٤٤٤]

**1114.** Ənəs ﭬ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İstər zalım, istərsə məzlum olsun (din) qardaşına kömək et!" (Əshabələr) soruşdular: "Ya Rəsulullah, məzluma kömək etməyi başa düşdük. Bəs zalıma necə kömək etməliyik?" Peyğəmbər ﷺ buyurdu: "Əlindən tutub saxlamaqla!" (əl-Buxari, 2444)

## 5-ci fəsil. Qiyamət günü zülm zülmətlərə çevriləcəkdir

## ٥– باب: الظُّلْمُ ظُلُمَاتٌ يَوْمَ الْقِيَامَةِ

١١١٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﭭ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «الظُّلْمُ ظُلُمَاتٌ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٢٤٤٧]

**1115.** Abdullah ibn Ömər ﭭ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü zülm zülmətlərə çevriləcəkdir." (əl-Buxari, 2447)

## 6-cı fəsil. Birisinə zülm etmiş adam ondan halallıq dilədiyi zaman ona etdiyi zülmü bildirməlidirmi?

## ٦– باب: مَنْ كَانَتْ لَهُ مَظْلَمَةٌ عِنْدَ الرَّجُلِ فَحَلَّلَهَا لَهُ، هَلْ يُبَيِّنُ مَظْلَمَتَهُ؟

١١١٦ – عَنْ أَبِى هُرَيْرَةَ ﭬ قَالَ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ كَانَتْ لَهُ مَظْلَمَةٌ لأَحَدٍ مِنْ عِرْضِهِ أَوْ شَىْءٍ فَلْيَتَحَلَّلْهُ مِنْهُ الْيَوْمَ، قَبْلَ أَنْ لاَ يَكُونَ دِينَارٌ وَلاَ دِرْهَمٌ، إِنْ كَانَ لَهُ عَمَلٌ صَالِحٌ أُخِذَ مِنْهُ بِقَدْرِ مَظْلَمَتِهِ، وَإِنْ لَمْ تَكُنْ لَهُ حَسَنَاتٌ أُخِذَ مِنْ سَيِّئَاتِ صَاحِبِهِ فَحُمِلَ عَلَيْهِ». [رواه البخاري: ٢٤٤٩]

**1116.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qoy birisinin namusuna toxunmaqla və ya ona başqa bir pislik etməklə zülm etmiş adam, bu gün, dinar və dirhəmin (fayda verməyəcəyi gün) gəlməmişdən əvvəl ondan halallıq diləsin. Əgər (Qiyamət günü) onun savabı olarsa, etdiyi zülm qədər savabından götürülər (və zülm etdiyi adama verilər); yox əgər savabı olmazsa, onda zülm etdiyi adamın günahlarından götürülüb onun boynuna qoyular." (əl-Buxari, 2449)

### 7-ci fəsil. Haqsızcasına (başqasının) torpağını zəbt edən kimsənin günahı

### ٧– باب: إِثْمُ مَنْ ظَلَمَ شَيْئًا مِنَ الأَرْضِ

١١١٧ – عَنْ سَعِيدِ بْنِ زَيْدٍ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «مَنْ ظَلَمَ مِنَ الأَرْضِ شَيْئًا طُوِّقَهُ مِنْ سَبْعِ أَرَضِينَ». [رواه البخاري: ٢٤٥٢]

**1117.** Rəvayət edilir ki, Səid ibn Zeyd ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Kim (başqasının) torpağını haqsızcasına zəbt etsə, (Qiyamət günü) torpağın yeddi qatı onun boynuna keçər." (əl-Buxari, 2452)

١١١٨ – عَنِ ابْنِ عُمَرَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «مَنْ أَخَذَ مِنَ الأَرْضِ شَيْئًا بِغَيْرِ حَقِّهِ خُسِفَ بِهِ يَوْمَ الْقِيَامَةِ إِلَى سَبْعِ أَرَضِينَ». [رواه البخاري: ٢٤٥٤]

**1118.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim (başqasının) torpağını haqsızcasına zəbt etsə, Qiyamət günü torpağın yeddi qatına girər." (əl-Buxari, 2454)

### 8-ci fəsil. Bir adam başqasının bir iş görməsinə izn verərsə, (bunu etmək ona) caiz olar

### ٨– باب: إِذَا أَذِنَ إِنْسَانٌ لآخَرَ شَيْئًا جَازَ

١١١٩ – عَنْ جَبَلَةَ كُنَّا بِالْمَدِينَةِ فِي بَعْضِ أَهْلِ الْعِرَاقِ، فَأَصَابَنَا سَنَةٌ، فَكَانَ ابْنُ الزُّبَيْرِ يَرْزُقُنَا التَّمْرَ، فَكَانَ ابْنُ عُمَرَ ﷺ يَمُرُّ بِنَا فَيَقُولُ إِنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنِ الإِقْرَانِ، إِلاَّ أَنْ يَسْتَأْذِنَ الرَّجُلُ مِنْكُمْ أَخَاهُ. [رواه البخاري: ٢٤٥٥]

**1119.** Rəvayət edilir ki, Cəbələ ﷺ demişdir: "Biz bəzi iraqlılarla birlikdə Mədinədə olarkən bizə qıtlıq üz verdi. O vaxt ibn Zubeyr bizə xurma paylayırdı. İbn Ömər isə bizim yanımızdan keçib deyərdi: "Peyğəmbər ﷺ iki-iki xurma götürüb yeməyi qadağan etmişdir. Ancaq aranızdan birinin digərindən izn istəməsi istisnadır." (əl-Buxari, 2455)

### 9-cu fəsil. Uca Allahın: "O, ən qatı mübahisəçidir."[1] sözü

### ٩– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَهُوَ أَلَدُّ ٱلْخِصَامِ﴾

١١٢٠ – عَنْ عَائِشَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنَّ أَبْغَضَ الرِّجَالِ إِلَى اللَّهِ الأَلَدُّ الْخَصِمُ». [رواه البخاري: ٢٤٥٧]

[1] "əl-Bəqərə" surəsi, 204.

**1120.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(İnsanlar arasında) Allahın ən nifrət etdiyi adam, ən qatı mübahisə edəndir." (əl-Buxari, 2457)

## 10-cu fəsil. Haqsız olduğunu bilə-bilə mübahisə edən adamın günahı

## ١٠– باب: إِثْمُ مَنْ خَاصَمَ فِي بَاطِلٍ وَهُوَ يَعْلَمُهُ

١١٢١ – عَنْ أُمِّ سَلَمَةَ ﵂ زَوْجِ النَّبِيِّ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ أَنَّهُ سَمِعَ خُصُومَةً بِبَابِ حُجْرَتِهِ، فَخَرَجَ إِلَيْهِمْ، فَقَالَ: «إِنَّمَا أَنَا بَشَرٌ وَإِنَّهُ يَأْتِينِي الْخَصْمُ، فَلَعَلَّ بَعْضَكُمْ أَنْ يَكُونَ أَبْلَغَ مِنْ بَعْضٍ، فَأَحْسِبُ أَنَّهُ صَدَقَ، فَأَقْضِي لَهُ بِذَلِكَ، فَمَنْ قَضَيْتُ لَهُ بِحَقِّ مُسْلِمٍ فَإِنَّمَا هِيَ قِطْعَةٌ مِنَ النَّارِ، فَلْيَأْخُذْهَا أَوْ فَلْيَتْرُكْهَا». [رواه البخاري: ٢٤٥٨]

**1121.** Peyğəmbərin ﷺ zövcəsi Ummu Sələmə ﷺ rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ hücrəsinin qapısı yanında mübahisə (edən adamların) səsini eşitdi və onların yanına çıxıb dedi: "Mən sadəcə bir insanam. Hərçənd mübahisələri düşmüş insanlar (mübahisələrini çözmək üçün) mənim yanıma gəlirlər, lakin olur ki, biriniz digərinizdən daha bəlağətlə danışır və mən də onun doğru danışdığını hesab edirəm. Bu səbəbdən də hökmü onun lehinə çıxarıram. Əgər mən (səhvən) bir müsəlmanın haqqını başqa birisinə verirəmsə, əslində, mən ona Cəhənnəm odundan bir parça vermiş oluram. (Bundan sonra isə özü bilər,) istər onu götürsün, istərsə də, tərk etsin." (əl-Buxari, 2458)

## 11-ci fəsil. Haqsızlığa məruz qalmış adam zalımın malını tapsa ondan öz haqqını götürə bilər

## ١١– باب: قِصَاصُ الْمَظْلُومِ إِذَا وَجَدَ مَالَ ظَالِمِهِ

١١٢٢ – عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ﵁ قَالَ: قُلْنَا لِلنَّبِيِّ ﷺ إِنَّكَ تَبْعَثُنَا فَنَنْزِلُ بِقَوْمٍ لاَ يَقْرُونَا فَمَا تَرَى فِيهِ فَقَالَ لَنَا: «إِنْ نَزَلْتُمْ بِقَوْمٍ، فَأُمِرَ لَكُمْ بِمَا يَنْبَغِي لِلضَّيْفِ فَاقْبَلُوا، فَإِنْ لَمْ يَفْعَلُوا فَخُذُوا مِنْهُمْ حَقَّ الضَّيْفِ». [رواه البخاري: ٢٤٦١]

**1122.** Rəvayət edilir ki, Uqbə ibn Amir ﷺ demişdir: "(Bir dəfə) biz Peyğəmbərə ﷺ dedik: "Sən bizi (dəvətə) göndərirsən və biz elə insanların yanında qalırıq ki, onlar bizi yeməyə qonaq etmək istəmirlər. Bu haqda nə deyə bilərsən?" Peyğəmbər ﷺ buyurdu: "Əgər bir tayfaya qonaq getsəniz və onlar sizi qonaq saxlasalar, onların ziyafətini qəbul edin. Yox əgər onlar sizi qonaq qəbul etmək istəməsələr, onda onlardan qonağa çatacaq payı götürün." (əl-Buxari, 2461)

## 12-ci fəsil. Heç kəs öz qonşusuna onun divarı dibində ağac basdırmağına mane olmamalıdır

## ١٢– باب: لاَ يَمْنَعُ جَارٌ جَارَهُ أَنْ يَغْرِزَ خَشَبَهُ فِي جِدَارِهِ

١١٢٣ – عَنْ أَبِي هُرَيْرَةَ رضى الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ يَمْنَعُ جَارٌ جَارَهُ أَنْ يَغْرِزَ خَشَبَهُ فِي جِدَارِهِ». ثُمَّ قَالَ أَبُو هُرَيْرَةَ ﵁ مَا لِي أَرَاكُمْ عَنْهَا مُعْرِضِينَ وَاللَّهِ لأَرْمِيَنَّ بِهَا بَيْنَ أَكْتَافِكُمْ. [رواه البخاري: ٢٤٦٣]

**1123.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heç kəs öz qonşusuna onun divarı dibində ağac basdırmağına mane olmamalıdır."
Sonra Əbu Hureyra (onu dinləyənlərə) dedi: "Nə üçün siz bu işdən boyun qaçırırsınız? Vallahi, mən bunu sizə daim xatırladacağam." (əl-Buxari, 2463)

## ١٣– باب: أَفْنِيَةُ الدُّورِ وَالْجُلُوسُ فِيهَا وَالْجُلُوسُ عَلَى الصُّعُدَاتِ

## 13-cü fəsil. Evlərin həyətləri, orada oturmaq, habelə yollarda oturmaq

١١٢٤ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِيَّاكُمْ وَالْجُلُوسَ عَلَى الطُّرُقَاتِ». فَقَالُوا مَا لَنَا بُدٌّ، إِنَّمَا هِيَ مَجَالِسُنَا نَتَحَدَّثُ فِيهَا. قَالَ: «فَإِذَا أَبَيْتُمْ إِلاَّ الْمَجَالِسَ فَأَعْطُوا الطَّرِيقَ حَقَّهَا» قَالُوا وَمَا حَقُّ الطَّرِيقِ قَالَ: «غَضُّ الْبَصَرِ، وَكَفُّ الأَذَى، وَرَدُّ السَّلاَمِ، وَأَمْرٌ بِالْمَعْرُوفِ، وَنَهْيٌ عَنِ الْمُنْكَرِ». [رواه البخاري: ٢٤٦٥]

**1124.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yollarda oturmayın!" (Əshabələr) dedilər: "Bizim orada oturmağımız labüddür. Biz oraya yığışıb ancaq (işlərimiz barədə) söhbət edirik." Peyğəmbər ﷺ buyurdu: "Əgər orada oturmağınız labüddürsə, onda yolun haqqını verin." (Əshabələr): "Nədir yolun haqqı?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Naməhrəmə baxmamaq, (heç kəsə) əziyyət verməmək, salamı almaq, yaxşı işləri əmr etmək və pis işlərdən çəkindirmək." (əl-Buxari, 2465)

## ١٤– باب: إِذَا اخْتَلَفُوا فِي الطَّرِيقِ الْمِيتَاءِ

## 14-cü fəsil. Əsas yol üstündə ixtilaf düşərsə (nə etmək lazımdır?)

١١٢٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَضَى النَّبِيُّ ﷺ إِذَا تَشَاجَرُوا فِي الطَّرِيقِ بِسَبْعَةِ أَذْرُعٍ. [رواه البخاري: ٢٤٧٣]

**1125.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbər ﷺ hökm vermişdir ki, əgər yol üstündə mübahisə düşərsə, keçid üçün yeddi ərəş[1] enində yol saxlamaq lazımdır." (əl-Buxari, 2473)

## ١٥– باب: النَّهْيُ عَنِ النُّهْبَى وَ الْمُثْلَةِ

## 15-ci fəsil. Soyğunçuluq etməyin və (ölüləri) eybəcər hala salmağın qadağan olunması

١١٢٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ يَزِيدَ الأَنْصَارِيِّ ﷺ قَالَ: نَهَى النَّبِيُّ ﷺ عَنِ النُّهْبَى وَالْمُثْلَةِ. [رواه البخاري: ٢٤٧٤]

**1126.** Rəvayət edilir ki, Abdullah ibn Yezid əl-Ənsari ﷺ demişdir: Peyğəmbər ﷺ soyğunçuluq etməyi və (ölüləri) eybəcər hala salmağı qadağan etmişdir." (əl-Buxari, 2474)

[1] 311-ci hədisin qeydlərinə bax.

## 16-cı fəsil. Malını qorumaq üçün vuruşan kimsə haqqında

## ١٦– باب: مَنْ قَاتَلَ دُونَ مَالِهِ

١١٢٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو رضي الله عنهما قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «مَنْ قُتِلَ دُونَ مَالِهِ فَهُوَ شَهِيدٌ». [رواه البخاري: ٢٤٨٠]

**1127.** Rəvayət edilir ki, Abdullah ibn Amr رضي الله عنهما demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Malını qorumaq üçün vuruşub (ölən) kimsə şəhiddir." (əl-Buxari, 2480)

## 17-ci fəsil. Birinin camı və ya başqa bir şeyi sındırılarsa (nə etməli?)

## ١٧– باب: إِذَا كَسَرَ قَصْعَةً أَوْ شَيْئًا لِغَيْرِهِ

١١٢٨ – عَنْ أَنَسٍ رضي الله عنه أَنَّ النَّبِيَّ ﷺ كَانَ عِنْدَ بَعْضِ نِسَائِهِ، فَأَرْسَلَتْ إِحْدَى أُمَّهَاتِ الْمُؤْمِنِينَ مَعَ خَادِمٍ بِقَصْعَةٍ فِيهَا طَعَامٌ فَضَرَبَتْ بِيَدِهَا، فَكَسَرَتِ الْقَصْعَةَ، فَضَمَّهَا، وَجَعَلَ فِيهَا الطَّعَامَ وَقَالَ: «كُلُوا». وَحَبَسَ الرَّسُولَ وَالْقَصْعَةَ حَتَّى فَرَغُوا، فَدَفَعَ الْقَصْعَةَ الصَّحِيحَةَ وَحَبَسَ الْمَكْسُورَةَ. [رواه البخاري: ٢٤٨١]

**1128.** Ənəs رضي الله عنه rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ zövcələrindən birinin evində idi. Bu əsnada möminlərin analarından[1] (başqa) birisi öz xidmətçisinin vasitəsilə Peyğəmbərə ﷺ taxta kasada pay göndərdi. Bu vaxt (evində olan zövcəsi) əli ilə qabı vurub sındırdı. Lakin Peyğəmbər ﷺ qabı yapışdırdı və yeməyi onun içinə qoyub: "Yeyin!"– dedi. Qabdakı yemək qurtarana qədər Peyğəmbər ﷺ xidmətçini yubatdı. Bundan sonra o, (pay verən zövcəsinə) təzə bir kasa göndərdi, sınmış kasanı isə özündə saxladı." (əl-Buxari, 2481)

[1] Uca Allah buyurur: "Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır. Zövcələri isə möminlərin analarıdır..." ("əl-Əhzab" surəsi, 6).

# ٤٨ – كِتَابُ الشَّرِكَةِ

# 48 – Şəriklik kitabı

## ١ – باب: الشَّرِكَةُ فِى الطَّعَامِ وَالنَّهْدِ وَالْعُرُوضِ

## 1-ci fəsil. Ərzaq mallarında, qoyulan xərcdə və (başqa) ticarət mallarında şəriklik

١١٢٩ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ قَالَ: خَفَّتْ أَزْوَادُ الْقَوْمِ وَأَمْلَقُوا، فَأَتَوُا النَّبِىَّ ﷺ فِى نَحْرِ إِبِلِهِمْ فَأَذِنَ لَهُمْ، فَلَقِيَهُمْ عُمَرُ فَأَخْبَرُوهُ فَقَالَ مَا بَقَاؤُكُمْ بَعْدَ إِبِلِكُمْ، فَدَخَلَ عَلَى النَّبِىِّ ﷺ فَقَالَ يَا رَسُولَ اللَّهِ مَا بَقَاؤُهُمْ بَعْدَ إِبِلِهِمْ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «نَادِ فِى النَّاسِ فَيَأْتُونَ بِفَضْلِ أَزْوَادِهِمْ». فَبُسِطَ لِذَلِكَ نِطَعٌ، وَجَعَلُوهُ عَلَى النِّطَعِ. فَقَامَ رَسُولُ اللَّهِ ﷺ فَدَعَا وَبَرَّكَ عَلَيْهِ ثُمَّ دَعَاهُمْ بِأَوْعِيَتِهِمْ فَاحْتَثَى النَّاسُ حَتَّى فَرَغُوا، ثُمَّ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنِّى رَسُولُ اللَّهِ». [رواه البخاري: ٢٤٨٤]

**1129.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ﷺ demişdir: "(Bir dəfə əshabələr səfərdə ikən onlardan) bəzilərinin ərzaq malları azaldı və onlar (yemək-içməyə) möhtac qaldılar. Odur ki, Peyğəmbərin ﷺ yanına gəlib öz dəvələrini kəsmək üçün ondan izn istədilər və o da onlara izn verdi. Sonra onlar Ömərə rast gəldilər və bu haqda ona xəbər verdilər. Ömər dedi: "Dəvələrinizi (kəsdikdən) sonra necə keçinəcəksiniz?" Bundan sonra Ömər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, onlar dəvələrini (kəsdikdən) sonra necə keçinəcəklər?" Peyğəmbər ﷺ buyurdu: "Camaata elan et, artıq qalmış ərzaqlarını gətirsinlər."

Bunun üçün yerə bir döşənək sərildi və (əshabələr) artıq qalmış ərzaqlarını onun içinə qoydular. (Ərzağın hamısı bir yerə yığıldıqdan) sonra Peyğəmbər ﷺ qalxıb dua etdi və (Allahdan) onun bərəkətli olmasını dilədi. Sonra əshabələrinə qablarını götürüb gəlməyi əmr etdi və onlar da gəlib ərzaqdan istədikləri qədər ovuclayıb götürdülər. Sonra Peyğəmbər ﷺ buyurdu: "Mən şahidlik edirəm ki, Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur və mən Allahın elçisiyəm! " (əl-Buxari, 2484)

١١٣٠ – عَنْ أَبِى مُوسَى ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ:«إِنَّ الأَشْعَرِيِّينَ إِذَا أَرْمَلُوا فِى الْغَزْوِ، أَوْ قَلَّ طَعَامُ عِيَالِهِمْ بِالْمَدِينَةِ جَمَعُوا مَا كَانَ عِنْدَهُمْ فِى ثَوْبٍ وَاحِدٍ، ثُمَّ اقْتَسَمُوهُ بَيْنَهُمْ فِى إِنَاءٍ وَاحِدٍ بِالسَّوِيَّةِ، فَهُمْ مِنِّى وَأَنَا مِنْهُمْ». [رواه البخاري: ٢٤٨٦]

**1130.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əşarilərin[1] döyüş əsnasında ərzağı azaldıqda və ya şəhərdə ikən ailələrinin yeməyi azaldıqda, onlar özlərində olan ərzağın hamısını bir parçanın üstünə yığar, sonra da bir qabla (hər kəs üçün) eyni ölçüdə çəkərək onu öz aralarında bölüşdürərdilər. Onlar məndəndirlər, mən də onlardanam." (əl-Buxari, 2486)

## ٢ – باب: قِسْمَةُ الْغَنَمِ

## 2-ci fəsil. Qoyunların bölüşdürülməsi

١١٣١ – عَنْ رَافِعِ بْنِ خَدِيجٍ ﷺ قَالَ: كُنَّا مَعَ النَّبِىِّ ﷺ بِذِى الْحُلَيْفَةِ فَأَصَابَ النَّاسَ جُوعٌ فَأَصَابُوا إِبِلاً وَغَنَمًا. قَالَ وَكَانَ النَّبِىُّ ﷺ فِى أُخْرَيَاتِ الْقَوْمِ فَعَجِلُوا وَذَبَحُوا وَنَصَبُوا الْقُدُورَ، فَأَمَرَ النَّبِىُّ ﷺ بِالْقُدُورِ فَأُكْفِئَتْ، ثُمَّ قَسَمَ

[1] Yəmən qəbilələrindən biri.

فَعَدَلَ عَشْرَةً مِنَ الْغَنَمِ بِبَعِيرٍ فَنَدَّ مِنْهَا بَعِيرٌ، فَطَلَبُوهُ فَأَعْيَاهُمْ، وَكَانَ فِى الْقَوْمِ خَيْلٌ يَسِيرَةٌ فَأَهْوَى رَجُلٌ مِنْهُمْ بِسَهْمٍ فَحَبَسَهُ اللَّهُ ثُمَّ قَالَ: «إِنَّ لِهَذِهِ الْبَهَائِمِ أَوَابِدَ كَأَوَابِدِ الْوَحْشِ فَمَا غَلَبَكُمْ مِنْهَا فَاصْنَعُوا بِهِ هَكَذَا». فَقُلْتُ أَنَا إِنَّا نَرْجُو – أَوْ نَخَافُ – الْعَدُوَّ غَدًا، وَلَيْسَتْ مَعَنَا مُدًى أَفَنَذْبَحُ بِالْقَصَبِ. قَالَ «مَا أَنْهَرَ الدَّمَ وَذُكِرَ اسْمُ اللَّهِ عَلَيْهِ، فَكُلُوهُ، لَيْسَ السِّنَّ وَالظُّفُرَ، وَسَأُحَدِّثُكُمْ عَنْ ذَلِكَ، أَمَّا السِّنُّ فَعَظْمٌ وَأَمَّا الظُّفُرُ فَمُدَى الْحَبَشَةِ». [رواه البخاري: ٢٤٨٨]

**1131.** Rəvayət edilir ki, Rafi ibn Xədic ﷺ demişdir: "(Bir dəfə) biz Peyğəmbərlə ﷺ birlikdə zül-Hüleyfədə olarkən camaata aclıq üz vermişdi. Onlar (döyüşdə) çoxlu dəvə və qoyun ələ keçirmişdilər. (Həmin vaxt) Peyğəmbər ﷺ arxada gələnlərin arasında idi. Onlar heyvanları (bir-bir) kəsməyə başladılar və qazanları odun üstünə qoydular. (Bir az keçdikdən) sonra Peyğəmbər ﷺ gəlib qazanları boşaltmağı əmr etdi. Sonra o, (heyvanları əshabələrin arasında) paylaşdırdı və on qoyunla bir dəvəni eyni hesab etdi. Bu vaxt dəvələrdən biri qaçdı. (Bəziləri) onun dalınca qaçdılar, lakin ona çata bilməyib yorğun düşdülər. Orduda az sayda atlı olduğundan (dəvəni tuta bilmədilər). Axırda onlardan biri dəvəni oxla vurdu və Allah bu dəvəni dayandırdı. Sonra Peyğəmbər ﷺ buyurdu: "Həqiqətən, bu heyvanlardan (bəzisi) vəhşiləşib vəhşi heyvanlar kimi olmuşdur. Odur ki, onlardan hansı biri əlinizdən çıxıb qaçarsa, onu oxla vurun." Mən dedim: "Biz (sabah) düşmənlə (qarşı-qarşıya) gəlməyimizi gözləyirik (və ya düşmənin qəfil hücumundan ehtiyat edirik). Yanımızda bıçaq da yoxdur (ki, heyvanları kəsək). Biz onları qamışla kəsə bilərikmi?" Peyğəmbər ﷺ buyurdu: "(Heyvanın) qanı axıdılsa və onun üstündə Allahın adı çəkilsə, ondan yeyə bilərsiniz. Lakin diş və dırnaqla kəsmək olmaz. Sizə bunun niyə qadağan olduğunu deyim: diş sümükdür,[1] dırnaq isə həbəşilərin bıçağıdır[2]". (əl-Buxari, 2488)

## 3-cü fəsil. Şəriklərə məxsus malların ədalətli şəkildə qiymətləndirilməsi

## ٣– باب: تَقْوِيمُ الأَشْيَاءِ بَيْنَ الشُّرَكَاءِ بِقِيمَةِ عَدْلٍ

١١٣٢ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «مَنْ أَعْتَقَ شَقِيصًا مِنْ مَمْلُوكِهِ فَعَلَيْهِ خَلاَصُهُ فِى مَالِهِ، فَإِنْ لَمْ يَكُنْ لَهُ مَالٌ قُوِّمَ الْمَمْلُوكُ، قِيمَةَ عَدْلٍ ثُمَّ اسْتُسْعِىَ غَيْرَ مَشْقُوقٍ عَلَيْهِ». [رواه البخاري: ٢٤٩٢]

**1132.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim öz köləsini qismən azad edərsə, öz malından şərikinin pulunu ödəməklə köləni tam azad etməlidir. Əgər onun ödəməyə pulu yoxdursa, onda köləni ədalətli şəkildə qiymətləndirməli, sonra da köləni gücü çatdığı bir işdə işlətməlidir.[3]" (əl-Buxari, 2492)

---

[1] Diş vasitəsilə heyvanı lazımi qaydada kəsmək mümkün olmadığından Peyğəmbər ﷺ bunu qadağan etmişdir.

[2] Həbəşilər kafir olduğundan Peyğəmbər ﷺ əshabələrinə onlara oxşamamağı buyurmuşdur.

[3] Əgər bir adamın şərikli köləsi varsa və bu köləni azad etmək istəyirsə, onda həmin adam öz payına düşən hissəni azad etməklə yanaşı digər yarısına görə öz malından götürüb şərikinin haqqını ödəməlidir. Yəni şəriki ilə birlikdə köləni qiymətləndirməli və dəyərin yarısını şərikinə ödəməlidir ki, köləni azad edə bilsin. Pulu olmadığı təqdirdə isə köləni gücü çatdığı işlərdə işlədib əvəzində aldığı pulu şərikinə ödəməklə onu tam şəkildə azad etməlidir.

## ٤ – باب: هَلْ يُقْرَعُ فِى الْقِسْمَةِ وَالاِسْتِهَامِ فِيهِ

## 4-cü fəsil. Bölgü aparıldığı zaman püşk atmaq olarmı?

١١٣٣ – عَنْ النُّعْمَانِ بْنِ بَشِيرٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَثَلُ الْقَائِمِ عَلَى حُدُودِ اللَّهِ وَالْوَاقِعِ فِيهَا كَمَثَلِ قَوْمٍ اسْتَهَمُوا عَلَى سَفِينَةٍ، فَأَصَابَ بَعْضُهُمْ أَعْلاَهَا وَبَعْضُهُمْ أَسْفَلَهَا، فَكَانَ الَّذِينَ فِى أَسْفَلِهَا إِذَا اسْتَقَوْا مِنَ الْمَاءِ مَرُّوا عَلَى مَنْ فَوْقَهُمْ فَقَالُوا لَوْ أَنَّا خَرَقْنَا فِى نَصِيبِنَا خَرْقًا، وَلَمْ نُؤْذِ مَنْ فَوْقَنَا. فَإِنْ يَتْرُكُوهُمْ وَمَا أَرَادُوا هَلَكُوا جَمِيعًا، وَإِنْ أَخَذُوا عَلَى أَيْدِيهِمْ نَجَوْا وَنَجَوْا جَمِيعًا». [رواه البخاري: ٢٤٩٣]

**1133.** Nomən ibn Bəşir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allahın qoyduğu hüdudları qoruyanların və onu aşanların halı, gəmiyə minmək üçün püşk atdıqdan sonra bir qismi gəminin göyərtəsinə, digərləri də gəminin aşağı mərtəbəsinə yerləşmiş bir toplumun halına bənzəyir. (Onlar dənizdə olduqları zaman) aşağıdakılar su istədikdə gəminin göyərtəsinə qalxıb yuxarıdakıların arasından keçir (və onları narahat edirlər). Onda aşağıdakılar deyirlər: “Gəlin, gəmini deşib buradan su götürək və yuxarıdakılara əziyyət verməyək.” Əgər yuxarıdakılar onların özbaşınalıq etməsinə göz yumsalar, (gəmi batacaq və) hamısı həlak olacaq; yox əgər bunun qarşısını alsalar, onda həm özləri, həm də aşağıdakılar xilas olacaqlar.” (əl-Buxari, 2493)

## ٥ – باب: الشَّرِكَةُ فِى الطَّعَامِ وَغَيْرِهِ

## 5-ci fəsil. Yeməyə və başqa şeylərə şərik olmaq

١١٣٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ هِشَامٍ ﷺ وَكَانَ قَدْ أَدْرَكَ النَّبِيَّ ﷺ وَذَهَبَتْ بِهِ أُمُّهُ زَيْنَبُ بِنْتُ حُمَيْدٍ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَتْ: يَا رَسُولَ اللَّهِ بَايِعْهُ. فَقَالَ: «هُوَ صَغِيرٌ». فَمَسَحَ رَأْسَهُ وَدَعَا لَهُ. يَخْرُجُ عَبْدُ اللَّهِ بْنُ هِشَامٍ إِلَى السُّوقِ فَيَشْتَرِى الطَّعَامَ فَيَلْقَاهُ ابْنُ عُمَرَ وَابْنُ الزُّبَيْرِ فَيَقُولاَنِ لَهُ أَشْرِكْنَا، فَإِنَّ النَّبِيَّ ﷺ قَدْ دَعَا لَكَ بِالْبَرَكَةِ فَيَشْرَكُهُمْ، فَرُبَّمَا أَصَابَ الرَّاحِلَةَ كَمَا هِىَ، فَيَبْعَثُ بِهَا إِلَى الْمَنْزِلِ. [رواه البخاري: ٢٥٠١-٢٥٠٢]

**1134.** Peyğəmbəri ﷺ görmüş (əshabələrdən biri) Abdullah ibn Hişam ﷺ rəvayət etmişdir ki, anası Zeynəb bint Humeyd onu Peyğəmbərin ﷺ yanına aparıb dedi: “Ya Rəsulullah, bunun beyətini qəbul et!” Peyğəmbər ﷺ: “O hələ balacadır[1]”– dedi və onun başını sığallayıb onun üçün dua etdi.

(Zuhra ibn Məbəd[2] demişdir:) “Abdullah ibn Hişam bazara gedib yemək alardı. (Həmin vaxt) ibn Ömər və ibn Zubeyr ona rast gəldikdə: “Bizi (yeməyinə) şərik et! Axı Peyğəmbər sənin üçün bərəkət diləyib”– deyər, o da onları yeməyinə şərik edərdi. Hərdən elə olurdu ki, o, bir dəvə (yükü qədər ərzaq) əldə edib onu evə yollayırdı. (əl-Buxari, 2501-2502)

[1] O vaxt Abdullahın altı yaşı var idi.
[2] Zuhra ibn Məbəd Abdullahın nəvəsidir.

# ٤٩ – كِتَابُ الرَّهْنِ

# 49 – Girov kitabı

## ١ – باب: الرَّهْنُ مَرْكُوبٌ وَمَحْلُوبٌ

## 1-ci fəsil. Girov[1] qoyulmuş minik heyvanına minmək, sağmal heyvanı da sağmaq (caizdir)

١١٣٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «الرَّهْنُ يُرْكَبُ بِنَفَقَتِه إِذَا كَانَ مَرْهُونًا، وَلَبَنُ الدَّرِّ يُشْرَبُ بِنَفَقَتِه إِذَا كَانَ مَرْهُونًا، وَعَلَى الَّذِى يَرْكَبُ وَيَشْرَبُ النَّفَقَةُ». [رواه البخاري: ٢٥١٢]

**1135.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “(Minik) heyvanı girov qoyulmuşdursa, (girov qaldığı müddət ərzində) ona çəkilən xərcin müqabilində onu minib sürmək olar. Sağmal heyvan girov qoyulmuşdursa, (girov qaldığı müddət ərzində) ona çəkilən xərcin müqabilində onu sağmaq olar. Xərcləri isə heyvanı minən və südünü içən kimsə ödəməlidir.” (əl-Buxari, 2512)

## ٢ – باب: إِذَا اخْتَلَفَ الرَّاهِنُ وَالْمُرْتَهِنُ

## 2-ci fəsil. Girov qoyanla girov götürən arasında ixtilaf düşərsə

١١٣٦ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّ النَّبِىَّ ﷺ قَضَى أَنَّ الْيَمِينَ عَلَى الْمُدَّعَى عَلَيْهِ. [رواه البخاري: ٢٥١٤]

**1136.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ hökm vermişdir ki, ittiham olunan adam and içməlidir”[2]. (əl-Buxari, 2514)

[1] Borc alınan pul və s. müqabilində təminat üçün verilən şey.

[2] Əgər iddiaçı dəlil-sübut olmadan bir kimsəyə qarşı ittiham irəli sürərsə, o zaman şəriətə görə müttəhim and içməli, beləliklə də, özünə qarşı olan iddianı inkar etməlidir. Əlavə olaraq 1090-cı və 1108-ci hədislərə bax.

# ٥٠ – كِتَابُ العِتْقِ

# 50 – Kölə azad etmə kitabı

## ١ – باب: مَا جَاءَ فِى الْعِتْقِ وَفَضْلِه

## 1-ci fəsil. Kölə azad etmə və bunun fəziləti barədə deyilənlər

١١٣٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ النَّبِيُّ ﷺ: «أَيُّمَا رَجُلٍ أَعْتَقَ امْرَأً مُسْلِمًا اسْتَنْقَذَ اللَّهُ بِكُلِّ عُضْوٍ مِنْهُ عُضْوًا مِنْهُ مِنَ النَّارِ». [رواه البخاري: ٢٥١٧]

**1137.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bir müsəlmanı köləlikdən azad edərsə, onun (azad olanın) hər bir əzasına görə, Allah azad edən adamın bir əzasını Cəhənnəm odundan xilas edər." (əl-Buxari, 2517)

## ٢ – باب: أَىُّ الرِّقَابِ أَفْضَلُ

## 2-ci fəsil. Hansı köləni azad etmək daha yaxşıdır?

١١٣٨ – عَنْ أَبِى ذَرٍّ ﷺ قَالَ: سَأَلْتُ النَّبِيَّ ﷺ أَىُّ الْعَمَلِ أَفْضَلُ، قَالَ: «إِيمَانٌ بِاللَّه، وَجِهَادٌ فِى سَبِيلِه». قُلْتُ فَأَىُّ الرِّقَابِ أَفْضَلُ قَالَ: «أَغْلاَهَا ثَمَنًا، وَأَنْفَسُهَا عِنْدَ أَهْلِهَا». قُلْتُ فَإِنْ لَمْ أَفْعَلْ. قَالَ: «تُعِينُ صَانِعًا أَوْ تَصْنَعُ لأَخْرَقَ». قَالَ فَإِنْ لَمْ أَفْعَلْ. قَالَ: «تَدَعُ النَّاسَ مِنَ الشَّرِّ، فَإِنَّهَا صَدَقَةٌ تَصَدَّقُ بِهَا عَلَى نَفْسِكَ». [رواه البخاري: ٢٥١٨]

**1138.** Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: "Mən Peyğəmbərdən ﷺ soruşdum: "Hansı əməl daha fəzilətli sayılır?" O buyurdu: "Allaha iman gətirmək və Onun yolunda cihad etmək." Mən soruşdum: "Hansı köləni azad etmək daha yaxşıdır?" O buyurdu: "Ən bahalı və sahibi üçün ən dəyərli olanı." Mən soruşdum: "Əgər bunu edə bilməsəm?" O buyurdu: "Bir iş görən adama kömək et və ya işi bacarmayan adamın işini gör." Mən soruşdum: "Əgər bunu da edə bilməsəm?" O buyurdu: "İnsanlara pislik etməkdən çəkin. Belə etsən, bu, sənin özünə verdiyin bir sədəqə olar." (əl-Buxari, 2518)

## ٣ – باب: إِذَا أَعْتَقَ عَبْدًا بَيْنَ اثْنَيْنِ أَوْ أَمَةً بَيْنَ الشُّرَكَاءِ

## 3-cü fəsil. İki nəfərə məxsus kölənin və ya bir neçə ortağın kənizinin azad edilməsi barədə

١١٣٩ – عَنْ عَبْدِ اللَّه بْنِ عُمَرَ ﷺ أَنَّ رَسُولَ اللَّه ﷺ قَالَ: «مَنْ أَعْتَقَ شِرْكًا لَهُ فِى عَبْدٍ، فَكَانَ لَهُ مَالٌ يَبْلُغُ ثَمَنَ الْعَبْدِ قُوِّمَ الْعَبْدُ قِيمَةَ عَدْلٍ، فَأَعْطَى شُرَكَاءَهُ حِصَصَهُمْ وَعَتَقَ عَلَيْه، وَإِلاَّ فَقَدْ عَتَقَ مِنْهُ مَا عَتَقَ». [رواه البخاري: ٢٥٢٢]

**1139.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim öz şərikli köləsini azad edərsə, özündə də kölənin dəyəri qədər pul varsa, köləni ədalətli şəkildə qiymətləndirməli, sonra da şəriklərinə onların paylarını ödəməklə köləni tam azad etməlidir. Əks təqdirdə isə onun yalnız öz payına düşən hissəsini azad etmiş olur.[1]" (əl-Buxari, 2522)

## 4-cü fəsil. Səhvən və ya unudaraq kölə azad etmək, qadını boşamaq və ya başqa bu kimi işlər görmək

## ٤ – باب: الْخَطَؤُ وَالنِّسْيَانُ فِى الْعَتَاقَةِ وَالطَّلَاقِ وَنَحْوِهِ

١١٤٠ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «إِنَّ اللَّهَ تَجَاوَزَ لِى عَنْ أُمَّتِى مَا وَسْوَسَتْ بِهِ صُدُورُهَا، مَا لَمْ تَعْمَلْ أَوْ تَكَلَّمْ». [رواه البخاري: ٢٥٢٨]

**1140.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah mənə (vəd etmişdir ki,) ümmətim (müəyyən) bir əməl etməyincə və ya bir söz danışmayınca, qəlblərinə gələn vəsvəsələrə görə onları cəzalandırmayacaqdır." (əl-Buxari, 2528)

## 5-ci fəsil. İnsanın öz köləsini azad etməyə niyyət edərək onun Allaha məxsus olduğunu bildirməsi, üstəlik başqalarını buna şahid olmağa çağırması

## ٥ – باب: إِذَا قَالَ رَجُلٌ لِعَبْدِهِ هُوَ لِلَّهِ، وَنَوَى الْعِتْقَ، وَالإِشْهَادُ فِى الْعِتْقِ

١١٤١ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّهُ لَمَّا أَقْبَلَ يُرِيدُ الإِسْلَامَ وَمَعَهُ غُلَامُهُ، ضَلَّ كُلُّ وَاحِدٍ مِنْهُمَا مِنْ صَاحِبِهِ، فَأَقْبَلَ بَعْدَ ذَلِكَ وَأَبُو هُرَيْرَةَ جَالِسٌ مَعَ النَّبِىِّ ﷺ فَقَالَ النَّبِىُّ ﷺ: «يَا أَبَا هُرَيْرَةَ، هَذَا غُلَامُكَ قَدْ أَتَاكَ». فَقَالَ أَمَا إِنِّى أُشْهِدُكَ أَنَّهُ حُرٌّ. قَالَ فَهُوَ حِينَ يَقُولُ:

يَا لَيْلَةً مِنْ طُولِهَا وَعَنَائِهَا عَلَى أَنَّهَا مِنْ دَارَةِ الْكُفْرِ نَجَّتِ

[رواه البخاري: ٢٥٣٠]

**1141.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ öz köləsi ilə birlikdə müsəlman olmaq üçün (Mədinəyə) gedərkən yolda bir-birilərini itirdilər. (Bir müddət) sonra Əbu Hureyra Peyğəmbərin ﷺ yanında oturarkən köləsi gəlib çıxdı. Peyğəmbər ﷺ dedi: "Ey Əbu Hureyra, xidmətçin gəlib çıxdı!" Əbu Hureyra dedi: "Səni şahid tuturam ki, o, azaddır."

Həmin vaxt Əbu Hureyra ﷺ dedi:

*Nə uzun, necə də ağır bir gecə idi,*
*Küfr məmləkətindən, o bizi xilas etdi.*

(əl-Buxari, 2530)

[1] 1132-ci hədisə bax.

## 6-cı fəsil. Müşriki azad etmək

## ٦– باب: عِتْقُ الْمُشْرِكِ

١١٤٢ – عَنْ حَكِيمِ بْنِ حِزَامٍ ﷺ أَعْتَقَ فِى الْجَاهِلِيَّةِ مِائَةَ رَقَبَةٍ، وَحَمَلَ عَلَى مِائَةِ بَعِيرٍ، فَلَمَّا أَسْلَمَ حَمَلَ عَلَى مِائَةِ بَعِيرٍ وَأَعْتَقَ مِائَةَ رَقَبَةٍ، قَالَ فَسَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ، أَرَأَيْتَ أَشْيَاءَ كُنْتُ أَصْنَعُهَا فِى الْجَاهِلِيَّةِ، كُنْتُ أَتَحَنَّثُ بِهَا، يَعْنِى أَتَبَرَّرُ بِهَا، قَالَ: فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَسْلَمْتَ عَلَى مَا سَلَفَ لَكَ مِنْ خَيْرٍ». [رواه البخاري: ٢٥٣٨]

**1142.** Rəvayət edilir ki, Həkim ibn Hizam ﷺ cahiliyyət dövründə yüz kölə azad etmiş və yüz dəvə paylamışdı[1]. Habelə müsəlman olduqdan sonra da yüz dəvə payladı və yüz kölə azad etdi.

(Həkim) demişdir: "Mən Peyğəmbərə ﷺ dedim: "Ey Allahın elçisi! Mənim cahiliyyət dövründə etdiyim yaxşılıqlar barədə nə deyə bilərsən?" Peyğəmbər buyurdu: "Sən olub-keçən yaxşılıqlarla bərabər müsəlman oldun!" (əl-Buxari, 2538)

## 7-ci fəsil. Ərəblər arasında köləyə sahib olan kimsələr

## ٧– باب: مَنْ مَلَكَ مِنَ الْعَرَبِ رَقِيقًا

١١٤٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ أَنَّ النَّبِىَّ ﷺ أَغَارَ عَلَى بَنِى الْمُصْطَلِقِ وَهُمْ غَارُّونَ وَأَنْعَامُهُمْ تُسْقَى عَلَى الْمَاءِ، فَقَتَلَ مُقَاتِلَتَهُمْ، وَسَبَى ذَرَارِيَّهُمْ، وَأَصَابَ يَوْمَئِذٍ جُوَيْرِيَةَ. [رواه البخاري: ٢٥٤١]

**1143.** Abdullah ibn Ömər ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ (müsəlmanların üstünə hücum etməyə hazırlaşan) Bəni Müstəliq qəbiləsinə, onlar xəbərsiz ikən hücum etdi. Həmin vaxt onların mal-qarası suvatda[2] su içirdi. Peyğəmbər ﷺ onların döyüşçülərini öldürdü, qadınlarını və uşaqlarını əsir götürdü. Cuveyriyaya da məhz bu döyüşdə sahib oldu.[3] (əl-Buxari, 2541)

١١٤٤ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: مَا زِلْتُ أُحِبُّ بَنِى تَمِيمٍ مُنْذُ ثَلاَثٍ سَمِعْتُ مِنْ رَسُولِ اللَّهِ ﷺ يَقُولُ فِيهِمْ، سَمِعْتُهُ يَقُولُ: «هُمْ أَشَدُّ أُمَّتِى عَلَى الدَّجَّالِ». قَالَ وَجَاءَتْ صَدَقَاتُهُمْ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «هَذِهِ صَدَقَاتُ قَوْمِنَا». وَكَانَتْ سَبِيَّةٌ مِنْهُمْ عِنْدَ عَائِشَةَ. فَقَالَ: «أَعْتِقِيهَا فَإِنَّهَا مِنْ وَلَدِ إِسْمَاعِيلَ». [رواه البخاري: ٢٥٤٣]

**1144.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbərin ﷺ Bəni Təmim qəbiləsi haqqında dediyi üç şeyi eşitdiyim gündən bəri mən bu qəbiləni sevirəm. Mən onun belə dediyini eşitdim: "Ümmətim içində dəccala qarşı ən sərt müqavimət göstərən onlar olacaq." Həmçinin onların verdiyi sədəqə gətirildiyi zaman Peyğəmbər ﷺ demişdir: "Bu, bizim adamların sədəqəsidir." (Üçüncüsü də budur ki,) Aişənin bu qəbilədən olan bir cariyəsi var idi. Peyğəmbər ﷺ (Aişəyə) buyurmuşdu: "Onu azad et. Çünki o, İsmailin nəslindəndir!" (əl-Buxari, 2543)

---

[1] Həkim ibn Hizam ﷺ bu dəvələri insanlara onların müvəqqəti istifadəsi üçün verərdi.

[2] Çaydan, arxdan və s.-dən su götürülən, habelə mal-qaranın su içdikləri dayaz yer.

[3] Cuveyriya bint əl-Haris ﷺ Peyğəmbərin ﷺ zövcəsidir.

## 8-ci fəsil. Köləyə qarşı təkəbbür göstərməyin, habelə ona "qulum və ya kənizim" deməyin bəyənilməməsi

## ٨– باب: كَرَاهِيَةُ التَّطَاوُلِ عَلَى الرَّقِيقِ، وَقَوْلِهِ عَبْدِى، أَوْ أَمَتِى

١١٤٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لاَ يَقُلْ أَحَدُكُمْ أَطْعِمْ رَبَّكَ، وَضِّئْ رَبَّكَ، اسْقِ رَبَّكَ، وَلْيَقُلْ سَيِّدِى مَوْلاَىَ، وَلاَ يَقُلْ أَحَدُكُمْ عَبْدِى أَمَتِى، وَلْيَقُلْ فَتَاىَ وَفَتَاتِى وَغُلاَمِى». [رواه البخاري: ٢٥٥٢]

**1145.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizlərdən heç kəs (köləyə): "Rəbbinə yemək ver", "Rəbbinə dəstəmaz almağa kömək et", "Rəbbinə su ver"– deməsin; qoy: "mənim ağam", "mənim himayədarım"– desin. Habelə heç kəs: "qulum", "kənizim"– deməsin; qoy: "oğlum", "qızım", "ay uşaq"– desin[1]". (əl-Buxari, 2552)

## 9-cu fəsil. (Sizlərdən birinin) xidmətçisi ona yemək gətirərsə

## ٩– باب: إِذَا أَتَاهُ خَادِمُهُ بِطَعَامِه

١١٤٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ: «إِذَا أَتَى أَحَدَكُمْ خَادِمُهُ بِطَعَامِه، فَإِنْ لَمْ يُجْلِسْهُ مَعَهُ، فَلْيُنَاوِلْهُ لُقْمَةً أَوْ لُقْمَتَيْنِ أَوْ أُكْلَةً أَوْ أُكْلَتَيْنِ، فَإِنَّهُ وَلِىَ عِلاَجَهُ». [رواه البخاري: ٢٥٥٧]

**1146.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Birinizin xidmətçisi ona yemək gətirdiyi zaman əgər onu yanında oturtmasa, qoy ona bir və ya iki loxma yemək versin. Çünki bunu o hazırlamışdır." (əl-Buxari, 2557)

## 10-cu fəsil. Köləni vurduqda onun üzünə vurmamaq haqqında

## ١٠– باب: إِذَا ضَرَبَ الْعَبْدَ فَلْيَجْتَنِبِ الْوَجْهَ

١١٤٧ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا قَاتَلَ أَحَدُكُمْ فَلْيَجْتَنِبِ الْوَجْهَ». [رواه البخاري: ٢٥٥٩]

**1147.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bir adamı) vurduğunuz zaman üzünə vurmayın!" (əl-Buxari, 2559)

## 11-ci fəsil. Özünü azad etmək istəyən köləyə hansı şərtləri qoymaq olar

## ١١– باب: مَا يَجُوزُ مِنْ شُرُوطِ الْمُكَاتَبِ

١١٤٨ – عَنْ عَائِشَةَ ﷺ أَنَّ بَرِيرَةَ جَاءَتْ تَسْتَعِينُهَا فِى كِتَابَتِهَا، وَلَمْ تَكُنْ قَضَتْ مِنْ كِتَابَتِهَا شَيْئًا، قَالَتْ لَهَا عَائِشَةُ ارْجِعِى إِلَى أَهْلِكِ، فَإِنْ أَحَبُّوا أَنْ أَقْضِىَ عَنْكِ كِتَابَتَكِ، وَيَكُونَ وَلاَؤُكِ لِى فَعَلْتُ. فَذَكَرَتْ ذَلِكَ بَرِيرَةُ لأَهْلِهَا فَأَبَوْا وَقَالُوا إِنْ شَاءَتْ أَنْ تَحْتَسِبَ عَلَيْكِ فَلْتَفْعَلْ، وَيَكُونَ وَلاَؤُكِ لَنَا، فَذَكَرَتْ ذَلِكَ لِرَسُولِ اللَّهِ ﷺ

[1] Bütün bunlar kölə ilə ağa arasındakı müraciətlərə aiddir.

فَقَالَ لَهَا رَسُولُ اللَّهِ ﷺ: «ابْتَاعِى فَأَعْتِقِى، فَإِنَّمَا الْوَلاَءُ لِمَنْ أَعْتَقَ». قَالَ ثُمَّ قَامَ رَسُولُ اللَّهِ ﷺ فَقَالَ: «مَا بَالُ أُنَاسٍ يَشْتَرِطُونَ شُرُوطًا لَيْسَتْ فِى كِتَابِ اللَّهِ مَنِ اشْتَرَطَ شَرْطًا لَيْسَ فِى كِتَابِ اللَّهِ فَلَيْسَ لَهُ، وَإِنْ شَرَطَ مِائَةَ مَرَّةٍ، شَرْطُ اللَّهِ أَحَقُّ وَأَوْثَقُ». [رواه البخاري: ٢٥٦١]

**1148.** Rəvayət edilir ki, Bərirə ﷺ Aişənin yanına gəlib, ondan əvvəlcədən yazılmış müqaviləyə əsasən ağasına müəyyən məbləğdə pul ödəyib onu kölələikdən azad etməsini xahiş etdi. Həmin vaxt o, (müəyyən edilmiş puldan) hələ heç bir şey ödəməmişdi. Aişə ona dedi: "Ağalarının yanına qayıt, (gör) əgər onlar, müqavilədə yazılmış məbləği ödəyəcəyim təqdirdə ağalıq hüququnu mənə verməyə razıdırlarsa, (pulu) ödəyim." Bərirə (Aişənin təklifini) ağalarına bildirdikdə onlar razılıq vermədilər və dedilər: "Əgər o, savab qazanmaq məqsədilə sənin yerinə pul vermək istəyirsə, versin; (lakin) sənə ağalıq etmək yenə bizə aid olacaq." Aişə bunu Peyğəmbərə ﷺ xəbər verdikdə, Peyğəmbər ﷺ ona buyurdu: "Sən onu al və azad et! Ağalıq etmək ancaq (köləni) azad edən kimsəyə aiddir." Sonra Peyğəmbər ﷺ (camaatın qarşısında) ayağa qalxıb dedi: "Nə üçün bəzi adamlar Allahın Kitabında olmayan şərtlər qoyurlar. Hər kim Allahın Kitabında olmayan bir şərt qoyarsa, bu şərt keçərli sayılmaz. Hətta yüz dəfə şərt kəssə belə. Allahın şərtləri daha doğru və daha etibarlıdır." (əl-Buxari, 2561)

# ٥١ – كِتَابُ فَضْلِ الهِبَةِ وَ التَّحْرِيضِ عَلَيْهَا

# 51 – Hədiyyə etməyin fəziləti və buna təşviq etmək kitabı

## ١– باب: فَضْلُ الهِبَةِ

## 1-ci fəsil. Hədiyyə etməyin fəziləti

١١٤٩ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «يَا نِسَاءَ الْمُسْلِمَاتِ لاَ تَحْقِرَنَّ جَارَةٌ لِجَارَتِهَا، وَلَوْ فِرْسِنَ شَاةٍ». [رواه البخاري: ٢٥٦٦]

**1149.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ey müsəlman qadınlar! Qoy heç bir qadın öz qonşusuna qoç dırnağı olsa belə (hədiyyə verməyi) ayıb hesab etməsin.” (əl-Buxari, 2566)

١١٥٠ – عَنْ عَائِشَةَ ﷺ أَنَّهَا قَالَتْ لِعُرْوَةَ يَا ابْنَ أُخْتِى، إِنْ كُنَّا لَنَنْظُرُ إِلَى الْهِلاَلِ ثُمَّ الْهِلاَلِ، ثَلاَثَةَ أَهِلَّة فِى شَهْرَيْنِ، وَمَا أُوقِدَتْ فِى أَبْيَاتِ رَسُولِ اللَّهِ ﷺ نَارٌ. فَقُلْتُ يَا خَالَةُ مَا كَانَ يُعِيشُكُمْ قَالَتِ الأَسْوَدَانِ التَّمْرُ وَالْمَاءُ، إِلاَّ أَنَّهُ قَدْ كَانَ لِرَسُولِ اللَّهِ ﷺ جِيرَانٌ مِنَ الأَنْصَارِ كَانَتْ لَهُمْ مَنَائِحُ، وَكَانُوا يَمْنَحُونَ رَسُولَ اللَّهِ ﷺ مِنْ أَلْبَانِهِمْ، فَيَسْقِينَا. [رواه البخاري: ٢٥٦٧]

**1150.** Rəvayət edilir ki, Aişə ﷺ Urvaya demişdir: “Bacım oğlu! Olurdu ki, biz bir hilal görür, sonra yenə bir hilal görür, hətta iki ayda üç hilal[1] görürdük, (lakin bu müddət ərzində) Peyğəmbərin ﷺ evlərində od qalanmırdı.[2]” (Urva dedi:) “Mən soruşdum: “Xalacan, bəs nə ilə dolanırdınız?” O dedi: “Xurma və su ilə. Bundan başqa Peyğəmbərin ﷺ ənsardan olan qonşuları var idi. Onların da sağmal dəvələri və qoyunları var idi. Onlar bu heyvanların südündən Peyğəmbərə ﷺ hədiyyə edər, o da onu bizə içirdərdi.” (əl-Buxari, 2567)

## ٢– باب: الْقَلِيلُ مِنَ الْهِبَةِ

## 2-ci fəsil. Balaca bir hədiyyə

١١٥١ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لَوْ دُعِيتُ إِلَى ذِرَاعٍ أَوْ كُرَاعٍ لأَجَبْتُ، وَلَوْ أُهْدِىَ إِلَىَّ ذِرَاعٌ أَوْ كُرَاعٌ لَقَبِلْتُ». [رواه البخاري: ٢٥٦٨]

**1151.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Məni qoyun ayağı yeməyə dəvət etsələr, gedərəm; mənə qoyun ayağı hədiyyə etsələr, qəbul edərəm.” (əl-Buxari, 2568)

---

[1] Yəni üç ay ərzində.

[2] Aişə ﷺ demək istəmişdir ki, aylarla Peyğəmbərin ﷺ evlərində isti yemək bişirilməzdi.

## 3-cü fəsil. Ovlanmış (heyvan) hədiyyə verilsə, onu qəbul etmək

## ٣– باب: قَبُولُ هَدِيَّةِ الصَّيْدِ

١١٥٢ – عَنْ أَنَسٍ ﷺ قَالَ أَنْفَجْنَا أَرْنَبًا بِمَرِّ الظَّهْرَانِ، فَسَعَى الْقَوْمُ فَلَغَبُوا، فَأَدْرَكْتُهَا فَأَخَذْتُهَا، فَأَتَيْتُ بِهَا أَبَا طَلْحَةَ فَذَبَحَهَا، وَبَعَثَ بِهَا إِلَى رَسُولِ اللَّهِ ﷺ بِوَرِكِهَا – أَوْ فَخِذَيْهَا فَقَبِلَهُ. وَ فِي رِوَايَةٍ: وَأَكَلَ مِنْهُ. [رواه البخاري: ٢٥٧٢]

**1152.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "(Bir dəfə) biz Mərruz-Zəhranda[1] olarkən bir dovşanı hürküdüb qaçırtdıq və camaat onun dalınca qaçmağa başladı, lakin (onu tuta bilməyib) yorulub əldən düşdülər. Mən ona çatıb onu tutdum, sonra da onu Əbu Təlhənin yanına gətirdim. O, dovşanı kəsdi və arxa ayaqlarını (və ya budunu) Peyğəmbərə ﷺ göndərdi. O da bu (hədiyyəni) qəbul etdi."

Digər rəvayətdə deyilmişdir: ".... o da ondan yedi." (əl-Buxari, 2572)

## 4-cü fəsil. Hədiyyəni qəbul etmək

## ٤– باب: قَبُولُ الْهَدِيَّةِ

١١٥٣ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ أَهْدَتْ أُمُّ حُفَيْدٍ خَالَةُ ابْنِ عَبَّاسٍ إِلَى النَّبِيِّ ﷺ أَقِطًا وَسَمْنًا وَأَضُبًّا، فَأَكَلَ النَّبِيُّ ﷺ مِنَ الأَقِطِ وَالسَّمْنِ، وَتَرَكَ الضَّبَّ تَقَذُّرًا. قَالَ ابْنُ عَبَّاسٍ فَأُكِلَ عَلَى مَائِدَةِ رَسُولِ اللَّهِ ﷺ، وَلَوْ كَانَ حَرَامًا مَا أُكِلَ عَلَى مَائِدَةِ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٢٥٧٥]

**1153.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "(Bir dəfə) ibn Abbasın xalası Peyğəmbərə ﷺ qurut, yağ və bir neçə kərtənkələ hədiyyə göndərdi. Peyğəmbər ﷺ qurutu və yağı yedi, kərtənkələləri isə xoşlamadığına görə qırağa qoydu."

İbn Abbas dedi: "(Bəziləri) Peyğəmbərin ﷺ süfrəsi başında kərtənkələləri yedilər. Əgər haram olsaydı, onlar Peyğəmbərin ﷺ süfrəsi başında yeyilməzdi." (əl-Buxari, 2575)

١١٥٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا أُتِيَ بِطَعَامٍ سَأَلَ عَنْهُ أَهَدِيَّةٌ أَمْ صَدَقَةٌ فَإِنْ قِيلَ صَدَقَةٌ. قَالَ لأَصْحَابِهِ كُلُوا. وَلَمْ يَأْكُلْ، وَإِنْ قِيلَ هَدِيَّةٌ. ضَرَبَ بِيَدِهِ ﷺ فَأَكَلَ مَعَهُمْ». [رواه البخاري: ٢٥٧٦]

**1154.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (hər dəfə) Peyğəmbərə ﷺ yemək gətirildikdə o bunun hədiyyə, yoxsa sədəqə olduğunu soruşardı. "Sədəqədir"– desəydilər, o, əshabələrinə: "Yeyin!"– deyər, özü isə yeməzdi. "Hədiyyədir"– desəydilər, əlini uzadıb əshabələri ilə birlikdə yeyərdi." (əl-Buxari, 2576)

١١٥٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: أُتِيَ النَّبِيُّ ﷺ بِلَحْمٍ فَقِيلَ تُصُدِّقَ عَلَى بَرِيرَةَ قَالَ: «هُوَ لَهَا صَدَقَةٌ، وَلَنَا هَدِيَّةٌ». [رواه البخاري: ٢٥٧٧]

**1155.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbərə ﷺ ət gətirdilər və: "(Bu,) Bəriraya sədəqə olaraq verilmişdir"– dedilər. Peyğəm-

[1] 309-cu hədisin qeydlərinə bax.

bər ﷺ buyurdu: "Bu, onun üçün sədəqə, bizim üçün isə hədiyyədir." (əl-Buxari, 2577)

## 5-ci fəsil. Dostuna hədiyyə vermək üçün onun öz zövcələrindən ancaq bəzisinin yanında qalacağı günü gözləyən kimsə

## ٥– باب: مَنْ أَهْدَى إِلَى صَاحِبِهِ وَتَحَرَّى بَعْضَ نِسَائِهِ دُونَ بَعْضٍ

١١٥٦ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ نِسَاءَ رَسُولِ اللَّهِ ﷺ كُنَّ حِزْبَيْنِ فَحِزْبٌ فِيهِ عَائِشَةُ وَحَفْصَةُ وَصَفِيَّةُ وَسَوْدَةُ، وَالْحِزْبُ الآخَرُ أُمُّ سَلَمَةَ وَسَائِرُ نِسَاءِ رَسُولِ اللَّهِ ﷺ، وَكَانَ الْمُسْلِمُونَ قَدْ عَلِمُوا حُبَّ رَسُولِ اللَّهِ ﷺ عَائِشَةَ، فَإِذَا كَانَتْ عِنْدَ أَحَدِهِمْ هَدِيَّةٌ يُرِيدُ أَنْ يُهْدِيَهَا إِلَى رَسُولِ اللَّهِ ﷺ أَخَّرَهَا، حَتَّى إِذَا كَانَ رَسُولُ اللَّهِ ﷺ فِى بَيْتِ عَائِشَةَ بَعَثَ صَاحِبُ الْهَدِيَّةِ إِلَى رَسُولِ اللَّهِ ﷺ فِى بَيْتِ عَائِشَةَ، فَكَلَّمَ حِزْبُ أُمِّ سَلَمَةَ، فَقُلْنَ لَهَا كَلِّمِى رَسُولَ اللَّهِ ﷺ يُكَلِّمُ النَّاسَ، فَيَقُولُ مَنْ أَرَادَ أَنْ يُهْدِىَ إِلَى رَسُولِ اللَّهِ ﷺ هَدِيَّةً فَلْيُهْدِهِ إِلَيْهِ حَيْثُ كَانَ مِنْ بُيُوتِ نِسَائِهِ، فَكَلَّمَتْهُ أُمُّ سَلَمَةَ بِمَا قُلْنَ، فَلَمْ يَقُلْ لَهَا شَيْئًا، فَسَأَلْنَهَا. فَقَالَتْ مَا قَالَ لِى شَيْئًا. فَقُلْنَ لَهَا فَكَلِّمِيهِ. قَالَتْ فَكَلَّمَتْهُ حِينَ دَارَ إِلَيْهَا أَيْضًا، فَلَمْ يَقُلْ لَهَا شَيْئًا، فَسَأَلْنَهَا. فَقَالَتْ مَا قَالَ لِى شَيْئًا. فَقُلْنَ لَهَا كَلِّمِيهِ حَتَّى يُكَلِّمَكِ. فَدَارَ إِلَيْهَا فَكَلَّمَتْهُ. فَقَالَ لَهَا: «لاَ تُؤْذِينِى فِى عَائِشَةَ، فَإِنَّ الْوَحْىَ لَمْ يَأْتِنِى، وَأَنَا فِى ثَوْبِ امْرَأَةٍ إِلاَّ عَائِشَةَ». قَالَتْ فَقَالَتْ أَتُوبُ إِلَى اللَّهِ مِنْ أَذَاكَ يَا رَسُولَ اللَّهِ. ثُمَّ إِنَّهُنَّ دَعَوْنَ فَاطِمَةَ بِنْتَ رَسُولِ اللَّهِ ﷺ فَأَرْسَلْنَ إِلَى رَسُولِ اللَّهِ ﷺ تَقُولُ إِنَّ نِسَاءَكَ يَنْشُدْنَكَ اللَّهَ الْعَدْلَ فِى بِنْتِ أَبِى بَكْرٍ. فَكَلَّمَتْهُ. فَقَالَ: «يَا بُنَيَّةُ، أَلاَ تُحِبِّينَ مَا أُحِبُّ». قَالَتْ بَلَى. فَرَجَعَتْ إِلَيْهِنَّ، فَأَخْبَرَتْهُنَّ. فَقُلْنَ ارْجِعِى إِلَيْهِ. فَأَبَتْ أَنْ تَرْجِعَ، فَأَرْسَلْنَ زَيْنَبَ بِنْتَ جَحْشٍ، فَأَتَتْهُ فَأَغْلَظَتْ، وَقَالَتْ إِنَّ نِسَاءَكَ يَنْشُدْنَكَ اللَّهَ الْعَدْلَ فِى بِنْتِ ابْنِ أَبِى قُحَافَةَ. فَرَفَعَتْ صَوْتَهَا، حَتَّى تَنَاوَلَتْ عَائِشَةَ. وَهِىَ قَاعِدَةٌ، فَسَبَّتْهَا حَتَّى إِنَّ رَسُولَ اللَّهِ ﷺ لَيَنْظُرُ إِلَى عَائِشَةَ هَلْ تَكَلَّمُ قَالَ فَتَكَلَّمَتْ عَائِشَةُ تَرُدُّ عَلَى زَيْنَبَ، حَتَّى أَسْكَتَتْهَا. قَالَتْ فَنَظَرَ النَّبِىُّ ﷺ إِلَى عَائِشَةَ، وَقَالَ: «إِنَّهَا بِنْتُ أَبِى بَكْرٍ». [رواه البخاري: ٢٥٨١]

**1156.** Aişədən رضي الله عنها rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcələri iki dəstəyə ayrılmışdılar. Bir dəstədə Aişə, Həfsə, Səfiyyə, Səudə, o biri dəstədə isə Ummu Sələmə və Peyğəmbərin ﷺ digər zövcələri idi. Müsəlmanlar Peyğəmbərin ﷺ Aişəni çox sevdiyini bilirdilər. Odur ki, birisi Peyğəmbərə ﷺ hədiyyə vermək istədikdə, Peyğəmbər ﷺ Aişənin evində gecələyəcəyi gün yetişənədək gözləyər, nəhayət, Peyğəmbər ﷺ Aişənin evinə gəldikdə hədiyyəni ona göndərərdi. Belə olduqda Ummu Sələmənin dəstəsindəki qadınlar ona dedilər: "Peyğəmbərlə ﷺ danış, camaata desin ki, kim Peyğəmbərə ﷺ hədiyyə vermək istəyirsə, (bunu təxirə salmasın), – Peyğəmbərin ﷺ zövcələrindən hansı birinin evində olursa olsun, – (hədiyyəni ona) göndərsin." Ummu Sələmə onların dediyini Peyğəmbərə ﷺ çatdırdı, lakin o heç nə demədi. Onlar Ummu Sələmədən (onun nə cavab verdiyini) soruşduqda o dedi: "O mənə heç nə demədi." Onlar Ummu Sələməyə: "Onunla (bir də) danış!"– dedilər. Peyğəmbər ﷺ Ummu Sələmənin yanına gəldikdə o yenə (bu haqda) onunla danışdı, lakin o yenə heç nə demədi. Onlar Ummu Sələmədən (onun nə cavab verdiyini)

soruşduqda o dedi: "O mənə heç nə demədi." Onda onlar dedilər: "O sənə hə-yoxunu bildirənədək ondan əl çəkmə!" Peyğəmbər ﷺ Ummu Sələmənin yanına gəldikdə o yenə (bu haqda) onunla danışdı. (Bu dəfə) Peyğəmbər ﷺ ona dedi: "Aişəyə görə mənə əziyyət verməyin! Həqiqətən, Aişədən başqa heç bir zövcəmin yanında mənə vəhy nazil olmamışdır." Ummu Sələmə dedi: "Sənə əziyyət verdiyimə görə Allaha tövbə edirəm, ya Rəsulullah!"

Sonra o qadınlar Peyğəmbərin ﷺ qızı Fatiməni çağırıb onu Peyğəmbərin ﷺ yanına göndərdilər ki, (ona) desin: "Zövcələrin səni Allaha and verib xahiş edirlər ki, onlarla, Əbu Bəkrin qızı ilə davrandığın kimi davranasan." Fatimə bunu Peyğəmbərə ﷺ deyəndə o dedi: "Qızım, mən sevdiyimi sən sevmirsənmi?" Fatimə: "Əlbəttə (sevirəm)"– deyə cavab verdi, sonra da qadınların yanına qayıdıb (Peyğəmbərin ﷺ dediyini) onlara xəbər verdi. Onlar (Fatiməyə): "Onun yanına qayıt!"– dedilər. Lakin o qayıtmadı. Belə olduqda onlar Zeynəb bint Cəhşi onun yanına göndərdilər. Zeynəb onun yanına gəlib çox sərt şəkildə: "Zövcələrin səni Allaha and verib xahiş edirlər ki, onlarla, ibn Əbu Quhafənin qızı ilə davrandığın kimi davranasan"- dedi, sonra da səsini qaldıraraq Aişəyə ağır sözlər deməyə başladı. Həmin vaxt Aişə (bir qıraqda) oturmuşdu. Peyğəmbər ﷺ ona baxırdı ki, görsün onun cavabını verəcək, ya yox. Aişə onun cavabını verməyə başladı və nəhayət, onu susdurdu. Onda Peyğəmbər ﷺ Aişəyə baxıb dedi: "O, həqiqətən də, Əbu Bəkrin qızıdır!" (əl-Buxari, 2581)

## ٦– باب: مَا لاَ يُرَدُّ مِنَ الْهَدِيَّةِ

## 6-cı fəsil. Verilən hədiyyədən imtina etməmək

١١٥٧ – عَنْ أَنَسٍ رضي الله عنه أَنَّ النَّبِيَّ ﷺ كَانَ لاَ يَرُدُّ الطِّيبَ. [رواه البخاري: ٢٥٨٢]

**1157.** Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ heç vaxt ətirdən imtina etməzdi. (əl-Buxari, 2582)

## ٧– باب: الْمُكَافَأَةُ فِى الْهِبَةِ

## 7-ci fəsil. Hədiyyə verənə bir şey əvəz vermək

١١٥٨ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَقْبَلُ الْهَدِيَّةَ وَيُثِيبُ عَلَيْهَا. [رواه البخاري: ٢٥٨٥]

**1158.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ hədiyyəni götürər və (onu verən adama) bir şey hədiyyə edərdi."(əl-Buxari, 2585)

## ٨– باب: الإِشْهَادُ فِى الْهِبَةِ

## 8-ci fəsil. Hədiyyə verdikdə şahid tutmaq

١١٥٩ – عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ رضي الله عنهما وَهُوَ عَلَى الْمِنْبَرِ يَقُولُ أَعْطَانِى أَبِى عَطِيَّةً، فَقَالَتْ عَمْرَةُ بِنْتُ رَوَاحَةَ لاَ أَرْضَى حَتَّى تُشْهِدَ رَسُولَ اللَّهِ ﷺ. فَأَتَى رَسُولَ اللَّهِ ﷺ فَقَالَ إِنِّى أَعْطَيْتُ ابْنِى مِنْ عَمْرَةَ بِنْتِ رَوَاحَةَ عَطِيَّةً،

فَأَمَرَتْنِى أَنْ أُشْهِدَكَ يَا رَسُولَ اللَّه. قَالَ: «أَعْطَيْتَ سَائِرَ وَلَدِكَ مِثْلَ هَذَا». قَالَ لاَ. قَالَ: «فَاتَّقُوا اللَّهَ، وَاعْدِلُوا بَيْنَ أَوْلاَدِكُمْ». قَالَ فَرَجَعَ فَرَدَّ عَطِيَّتَهُ. [رواه البخاري: ٢٥٨٧]

**1159.** Rəvayət edilir ki, Nomən ibn Bəşir ﵄ minbərdə ikən demişdir: "(Bir dəfə) atam mənə bir hədiyyə verdi. Lakin (anam) Amra bint Rəvaha (ona): "Sən Peyğəmbəri ﷺ şahidlik etməyə çağırmayınca mən buna razılıq verən deyiləm"– dedi. Onda atam Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Mən Amra bint Rəvahadan olan oğluma hədiyyə verdim. Lakin (yoldaşım) məndən səni buna şahid tutmağımı istədi, ya Rəsulullah." Peyğəmbər ﷺ soruşdu: "O biri övladlarına da bu cür hədiyyə verdinmi?" (Atam): "Xeyr!"– deyə cavab verdi. Onda Peyğəmbər ﷺ buyurdu: "Allahdan qorxun və övladlarınıza (olan münasibətdə) ədalətli olun!" Bundan sonra (atam) qayıdıb hədiyyəsini geri götürdü. (əl-Buxari, 2587)

## ٩– باب: هِبَةُ الرَّجُلِ لاِمْرَأَتِهِ وَالْمَرْأَةِ لِزَوْجِهَا

## 9-cu fəsil. Kişinin öz qadınına, qadının da öz ərinə hədiyyə verməsi

١١٦٠ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «الْعَائِدُ فِى هِبَتِهِ كَالْكَلْبِ يَقِيءُ، ثُمَّ يَعُودُ فِى قَيْئِهِ». [رواه البخاري: ٢٥٨٩]

**1160.** İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Verdiyi hədiyyəni geri götürən adam, qusduqdan sonra qayıdıb qusduğunu yeyən itə bənzəyir." (əl-Buxari, 2589)

## ١٠– باب: هِبَةُ الْمَرْأَةِ لِغَيْرِ زَوْجِهَا، وَعِتْقُهَا إِذَا كَانَ لَهَا زَوْجٌ

## 10-cu fəsil. Qadının ərindən başqa birisinə hədiyyə verməsi və əri sağ ikən öz kölələrini azad etməsi

١١٦١ – عَنْ مَيْمُونَةَ بِنْتِ الْحَارِثِ ﵂ أَنَّهَا أَعْتَقَتْ وَلِيدَةً وَلَمْ تَسْتَأْذِنِ النَّبِيَّ ﷺ، فَلَمَّا كَانَ يَوْمُهَا الَّذِى يَدُورُ عَلَيْهَا فِيهِ قَالَتْ أَشَعَرْتَ يَا رَسُولَ اللَّهِ أَنِّى أَعْتَقْتُ وَلِيدَتِى قَالَ: «أَوَفَعَلْتِ». قَالَتْ نَعَمْ. قَالَ: «أَمَا إِنَّكِ لَوْ أَعْطَيْتِيهَا أَخْوَالَكِ كَانَ أَعْظَمَ لأَجْرِكِ». [رواه البخاري: ٢٥٩٢]

**1161.** Rəvayət edilir ki, Meymunə bint əl-Haris ﵂ Peyğəmbərdən ﷺ izn almamış bir kəniz azad etdi. Peyğəmbər ﷺ Meymunənin evində gecələyəcəyi gün onun yanına gəldikdə, o, Peyğəmbərə ﷺ dedi: "Xəbərin var, ya Rəsulullah, mən öz kənizimi azad etmişəm?" Peyğəmbər ﷺ soruşdu: "Doğrudan belə etmisən?" O: "Bəli!"– dedi. Onda Peyğəmbər ﷺ buyurdu: "Hərgah sən onu öz dayılarına[1] versəydin, sənin mükafatın daha böyük olardı." (əl-Buxari, 2592)

[1] Burada Meymunənin ﵂ dayıları nəzərdə tutulur.

١١٦٢ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا أَرَادَ سَفَرًا أَقْرَعَ بَيْنَ نِسَائِهِ، فَأَيَّتُهُنَّ خَرَجَ سَهْمُهَا خَرَجَ بِهَا مَعَهُ، وَكَانَ يَقْسِمُ لِكُلِّ امْرَأَةٍ مِنْهُنَّ يَوْمَهَا وَلَيْلَتَهَا، غَيْرَ أَنَّ سَوْدَةَ بِنْتَ زَمْعَةَ وَهَبَتْ يَوْمَهَا وَلَيْلَتَهَا، لِعَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ تَبْتَغِي بِذَلِكَ رِضَا رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٢٥٩٣]

**1162.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ səfərə çıxmaq istədikdə zövcələri arasında püşk atardı. Püşk kimə düşsəydi, onu özü ilə səfərə apardı. Habelə, hər bir qadını üçün bir gün və gecə ayırmışdı.[1]"

(Hədisi danışan ravi demişdir): "Yalnız Səudə bint Zəm'adan başqa – o, Peyğəmbərin ﷺ razılığını qazanmaq üçün öz növbəsini Peyğəmbərin ﷺ zövcəsi Aişəyə hədiyyə etmişdi." (əl-Buxari, 2593)

## 11-ci fəsil. (Hədiyyə verilən) köləni və əmlakı necə qəbul etməli

## ١١– باب: كَيْفَ يُقْبَضُ الْعَبْدُ وَالْمَتَاعُ

١١٦٣ – عَنْ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ ﵄ قَالَ: قَسَمَ رَسُولُ اللَّهِ ﷺ أَقْبِيَةً، وَلَمْ يُعْطِ مَخْرَمَةَ مِنْهَا شَيْئًا، فَقَالَ مَخْرَمَةُ يَا بُنَيَّ انْطَلِقْ بِنَا إِلَى رَسُولِ اللَّهِ ﷺ. فَانْطَلَقْتُ مَعَهُ، فَقَالَ ادْخُلْ فَادْعُهُ لِي. قَالَ فَدَعَوْتُهُ لَهُ فَخَرَجَ إِلَيْهِ، وَعَلَيْهِ قَبَاءٌ مِنْهَا، فَقَالَ: «خَبَأْنَا هَذَا لَكَ». قَالَ فَنَظَرَ إِلَيْهِ، فَقَالَ رَضِيَ مَخْرَمَةُ. [رواه البخاري: ٢٥٩٩]

**1163.** Rəvayət edilir ki, Misvər ibn Məxrəmə ﵄ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ kaftanları[2] (əshabələrə) payladı və Məxrəməyə heç bir şey vermədi. Məxrəmə (mənə) dedi: "Oğlum, gedək Peyğəmbərin ﷺ yanına." Mən onunla birlikdə (Peyğəmbərin ﷺ yanına) getdim. (Atam mənə): "İçəri gir, onu çağır"- dedi. Mən Peyğəmbəri ﷺ çağırdım və o, əynində həmin kaftanlardan biri atamın qabağına çıxdı və: "Bunu sənin üçün saxlamışıq"– deyə buyurdu. (Məxrəmə) kaftana baxdı və: "Məxrəmə razı qaldı[3]"– dedi." (əl-Buxari, 2599)

## 12-ci fəsil. Geyinilməsi bəyənilməyən geyimi hədiyyə etmək

## ١٢– باب: هَدِيَّةُ مَا يُكْرَهُ لُبْسُهَا

١١٦٤ – عَنْ ابْنِ عُمَرَ ﵄ قَالَ: أَتَى النَّبِيُّ ﷺ بَيْتَ فَاطِمَةَ فَلَمْ يَدْخُلْ عَلَيْهَا، وَجَاءَ عَلِيٌّ فَذَكَرَتْ لَهُ ذَلِكَ فَذَكَرَهُ لِلنَّبِيِّ ﷺ قَالَ: «إِنِّي رَأَيْتُ عَلَى بَابِهَا سِتْرًا مَوْشِيًّا». فَقَالَ: «مَا لِي وَلِلدُّنْيَا». فَأَتَاهَا عَلِيٌّ فَذَكَرَ ذَلِكَ لَهَا فَقَالَتْ لِيَأْمُرْنِي فِيهِ بِمَا شَاءَ. قَالَ تُرْسِلُ بِهِ إِلَى فُلَانٍ. أَهْلِ بَيْتٍ بِهِمْ حَاجَةٌ. [رواه البخاري: ٢٦١٣]

**1164.** Rəvayət edilir ki, ibn Ömər ﵄ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ qızı Fatimənin evinə gəldi, lakin içəri daxil olmadı. Əli ﵁ evə gəldikdə Fatimə bunu ona bildirdi, o da Peyğəmbərdən ﷺ (bunun səbəbini) soruşdu. (Peyğəmbər ﷺ) buyurdu: "Mən onun qapısında rəngbərəng naxışlı pərdə gördüm." Sonra da əlavə edib dedi: "Dünya hara, mən hara?!" Bundan sonra Əli ﵁ gəlib (onun dediklərini) Fatiməyə xəbər verdi. Fatimə dedi: "Qoy o mənə buna dair nə is-

---

[1] Yəni gündəlik olaraq hər gecə bir zövcəsinin yanında qalardı.
[2] Uzun ətəkli qədim kəndli paltarı.
[3] Yaxud ehtimal edilir ki: "...Peyğəmbər ﷺ ona baxıb: "Məxrəmə razı qaldımı?"- deyə soruşdu."

təyirsə, onu əmr etsin, (mən onun dediyi kimi edərəm).” Peyğəmbər ﷺ buyurdu: “Bunu filankəsə – ailəsinin ehtiyacı olan birisinə göndər.” (əl-Buxari, 2613)

١١٦٥ – عَنْ عَلِيٍّ رضي الله عنه قَالَ: أَهْدَى إِلَيَّ النَّبِيُّ ﷺ حُلَّةً سِيَرَاءَ فَلَبِسْتُهَا، فَرَأَيْتُ الْغَضَبَ فِي وَجْهِهِ، فَشَقَقْتُهَا بَيْنَ نِسَائِي. [رواه البخاري: ٢٦١٤]

**1165.** Rəvayət edilir ki, Əli رضي الله عنه demişdir: “Peyğəmbər ﷺ mənə ipəkdən olan miləmil parçadan tikilmiş bir paltar hədiyyə etdi və mən də onu əynimə geyindim. Lakin sonra onun qəzəbləndiyini gördüm və paltarı iki yerə bölüb qadınlarıma[1] verdim.” (əl-Buxari, 2614)

## 13-cü fəsil. Müşriklərdən hədiyyə qəbul etmək

## ١٣– باب: قَبُولُ الْهَدِيَّةِ مِنَ الْمُشْرِكِينَ

١١٦٦ – عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي بَكْرٍ رضي الله عنهما قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ ثَلاَثِينَ وَمِائَةً فَقَالَ النَّبِيُّ ﷺ: «هَلْ مَعَ أَحَدٍ مِنْكُمْ طَعَامٌ». فَإِذَا مَعَ رَجُلٍ صَاعٌ مِنْ طَعَامٍ أَوْ نَحْوُهُ، فَعُجِنَ ثُمَّ جَاءَ رَجُلٌ مُشْرِكٌ مُشْعَانٌّ طَوِيلٌ بِغَنَمٍ يَسُوقُهَا، فَقَالَ النَّبِيُّ ﷺ: «بَيْعًا أَمْ عَطِيَّةً – أَوْ قَالَ – أَمْ هِبَةً». قَالَ لاَ، بَلْ بَيْعٌ. فَاشْتَرَى مِنْهُ شَاةً، فَصُنِعَتْ وَأَمَرَ النَّبِيُّ ﷺ بِسَوَادِ الْبَطْنِ أَنْ يُشْوَى، وَايْمُ اللَّهِ مَا فِي الثَّلاَثِينَ وَالْمِائَةِ إِلاَّ قَدْ حَزَّ النَّبِيُّ ﷺ لَهُ حُزَّةً مِنْ سَوَادِ بَطْنِهَا، إِنْ كَانَ شَاهِدًا أَعْطَاهَا إِيَّاهُ، وَإِنْ كَانَ غَائِبًا خَبَأَ لَهُ، فَجَعَلَ مِنْهَا قَصْعَتَيْنِ، فَأَكَلُوا أَجْمَعُونَ، وَشَبِعْنَا، فَفَضَلَتِ الْقَصْعَتَانِ، فَحَمَلْنَاهُ عَلَى الْبَعِيرِ. أَوْ كَمَا قَالَ. [رواه البخاري: ٢٦١٨]

**1166.** Rəvayət edilir ki, Abdur-Rəhman ibn Əbu Bəkr رضي الله عنهما demişdir: “Bir dəfə biz – yüz otuz nəfər Peyğəmbərlə ﷺ bir yerdə olarkən Peyğəmbər ﷺ soruşdu: “Yanında yeməyi olan varmı?” Bu vaxt bir nəfərin (xurcunundan) bir saa un çıxdı və bundan xəmir yoğruldu. Sonra hündürboylu, saçları dağınıq halda olan bir müşrik bizim yanımıza gəldi və özü ilə qoyun sürüsü gətirdi. Peyğəmbər ﷺ soruşdu: “Satırsan, ya hədiyyə verirsən?” O: “Xeyr, satıram!”- dedi. Onda Peyğəmbər ﷺ ondan bir qoç aldı və (ondan) yemək bişirildi. Sonra Peyğəmbər ﷺ onun içalatını qızartmağı əmr etdi. Allaha and olsun ki, Peyğəmbər ﷺ bu içalatdan yüz otuz nəfərin hər birinə verdi. Orada olanların payını özlərinə verdi, olmayanların payını isə ayırıb saxladı. Qalan əti də iki qaba qoydu. Hamımız (ondan) yeyib doyduq. Axırda iki qab yemək artıq qaldı. Onu da dəvəyə yüklədik.” (əl-Buxari, 2618)

## 14-cü fəsil. Müşriklərə hədiyyə vermək

## ١٤– باب: الْهَدِيَّةُ لِلْمُشْرِكِينَ

١١٦٧ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ رضي الله عنهما قَالَتْ: قَدِمَتْ عَلَيَّ أُمِّي وَهِيَ مُشْرِكَةٌ، فِي عَهْدِ رَسُولِ اللَّهِ ﷺ، فَاسْتَفْتَيْتُ رَسُولَ اللَّهِ ﷺ قُلْتُ: إِنَّ أُمِّي قَدِمَتْ وَهِيَ رَاغِبَةٌ، أَفَأَصِلُ أُمِّي قَالَ: «نَعَمْ صِلِي أُمَّكِ». [رواه البخاري: ٢٦٢٠]

[1] Burada o, zövcəsini və qohum-əqrəbasından olan qadınları qəsd edir.

**1167.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr ﵂ demişdir: "Peyğəmbərin ﷺ zamanında anam müşrik olduğu halda mənim yanıma gəldi. Mən bu məsələ ilə bağlı Peyğəmbərə ﷺ müraciət etdim və dedim: "Anam gəlib, ona qayğı göstərməyimi istəyir. Mən onunla əlaqə saxlaya bilərəmmi?" O: "Bəli, əlaqə saxlaya bilərsən"– dedi." (əl-Buxari, 2620)

## 15-ci fəsil

## ١٥– باب

١١٦٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُبَيْدِ اللَّهِ بْنِ أَبِى مُلَيْكَةَ أَنَّ بَنِى صُهَيْبٍ مَوْلَى ابْنِ جُدْعَانَ ادَّعَوْا بَيْتَيْنِ وَحُجْرَةً، أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَعْطَى ذَلِكَ صُهَيْبًا، فَقَالَ مَرْوَانُ مَنْ يَشْهَدُ لَكُمَا عَلَى ذَلِكَ قَالُوا ابْنُ عُمَرَ. فَدَعَاهُ فَشَهِدَ لأَعْطَى رَسُولُ اللَّهِ ﷺ صُهَيْبًا بَيْتَيْنِ وَحُجْرَةً. فَقَضَى مَرْوَانُ بِشَهَادَتِهِ لَهُمْ. [رواه البخاري: ٢٦٢٤]

**1168.** Rəvayət edilir ki, Abdullah ibn Ubeydullah ibn Əbu Muleykə demişdir: "İbn Cudanın azad etdiyi Suheyb oğulları iddia edirdilər ki, Peyğəmbər ﷺ Suheybə iki ev və bir hücrə bağışlamışdır. Mərvan soruşdu: "Sizin dediyinizi kim təsdiq edə bilər?" Onlar dedilər: "İbn Ömər!" Sonra Mərvan ibn Öməri çağırdı və o təsdiq etdi ki, Peyğəmbər ﷺ Suheybə iki ev və bir hücrə bağışlamışdır. Beləliklə, Mərvan onun şahidliyini əsas götürüb onların lehinə hökm verdi." (əl-Buxari, 2624)

## 16-cı fəsil. "Umra" və "ruqbə"[1] deyilən hədiyyələri vermək

## ١٦– باب: مَا قِيلَ فِى الْعُمْرَى وَالرُّقْبَى

١١٦٩ – عَنْ جَابِرٍ ﷺ قَالَ: قَضَى النَّبِىُّ ﷺ بِالْعُمْرَى أَنَّهَا لِمَنْ وُهِبَتْ لَهُ. [رواه البخاري: ٢٦٢٥]

**1169.** Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Peyğəmbər ﷺ hökm etmişdir ki, "umra" hədiyyəsi, onun verildiyi adama məxsusdur." (əl-Buxari, 2625)

## 17-ci fəsil. Toy gecəsi gəlin üçün burovuz[2] paltar almaq

## ١٧– باب: الاِسْتِعَارَةُ لِلْعَرُوسِ عِنْدَ الْبِنَاءِ

١١٧٠ – عَنْ أَيْمَنَ قَالَ: دَخَلْتُ عَلَى عَائِشَةَ ﵅ وَعَلَيْهَا دِرْعُ قِطْرٍ ثَمَنُ خَمْسَةِ دَرَاهِمَ، فَقَالَت ارْفَعْ بَصَرَكَ إِلَى جَارِيَتِى، انْظُرْ إِلَيْهَا فَإِنَّهَا تُزْهَى أَنْ تَلْبَسَهُ فِى الْبَيْتِ، وَقَدْ كَانَ لِى مِنْهُنَّ دِرْعٌ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ، فَمَا كَانَتِ امْرَأَةٌ تُقَيَّنُ بِالْمَدِينَةِ إِلاَّ أَرْسَلَتْ إِلَىَّ تَسْتَعِيرُهُ. [رواه البخاري: ٢٦٢٨]

---

[1] Bu, islamaqədərki dövrdə ərəblər arasında yayılmış hədiyyə üslubudur. "Umra" belə idi ki, bir nəfər başqa birisinə ömürlük olaraq bir mülkü hədiyyə edərdi və əgər bu adam ölürdüsə, hədiyyə yenidən sahibinə qaytarılırdı. "Ruqbə" də belə idi ki, bir nəfər başqa birisinə hədiyyə etmək istədikdə deyərdi: "Mən bu evi sənə ömürlük hədiyyə edirəm. Əgər mən birinci ölsəm, ev sənin olsun, yox əgər sən məndən əvvəl ölsən, ev yenidən mənim olacaq." Tərəflərdən hər biri digərinin ölümünü gözlədiyinə görə bu növ hədiyyə qadağan edilmişdir.

[2] Qaytarılmaq şərti ilə alınan; müvəqqəti istifadə üçün alınan.

**1170.** Rəvayət edilir ki, Əymən demişdir: "(Bir dəfə) mən Aişənin رضي الله عنها (hücrəsinə) daxil oldum. Həmin vaxt onun əynində qiyməti beş dirhəm olan qalın parçadan bir paltar var idi. O (mənə) dedi: "Başını qaldır cariyəmə[1] bax! O, bu paltarı evin içində geyinməyi özünə sığışdırmır. (Yadımdadır ki,) Peyğəmbərin ﷺ dövründə mənim belə bir paltarım var idi. Mədinədə zifaf[2] gecəsi üçün bəzənmək istəyən elə bir qadın yox idi ki, mənə xəbər göndərib o paltarı burovuz istəməsin." (əl-Buxari, 2628)

## 18-ci fəsil. Ehtiyacı olan adama müvəqqəti istifadə etmək üçün mal-mülk verməyin fəziləti

## ١٨ – بَاب: فَضْلُ الْمَنِيحَةِ

١١٧١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ لَمَّا قَدِمَ الْمُهَاجِرُونَ الْمَدِينَةَ مِنْ مَكَّةَ وَلَيْسَ بِأَيْدِيهِمْ – يَعْنِي شَيْئًا – وَكَانَتِ الأَنْصَارُ أَهْلَ الأَرْضِ وَالْعَقَارِ، فَقَاسَمَهُمُ الأَنْصَارُ عَلَى أَنْ يُعْطُوهُمْ ثِمَارَ أَمْوَالِهِمْ كُلَّ عَامٍ وَيَكْفُوهُمُ الْعَمَلَ وَالْمَئُونَةَ، وَكَانَتْ أُمُّهُ أُمُّ أَنَسٍ أُمُّ سُلَيْمٍ كَانَتْ أُمَّ عَبْدِ اللَّهِ بْنِ أَبِي طَلْحَةَ ، فَكَانَتْ أَعْطَتْ أُمُّ أَنَسٍ رَسُولَ اللَّهِ ﷺ عِذَاقًا فَأَعْطَاهُنَّ النَّبِيُّ ﷺ أُمَّ أَيْمَنَ مَوْلاَتَهُ أُمَّ أُسَامَةَ بْنِ زَيْدٍ. قَالَ أَنَسُ بْنُ مَالِكٍ رضي الله عنه أَنَّ النَّبِيَّ ﷺ لَمَّا فَرَغَ مِنْ قَتْلِ أَهْلِ خَيْبَرَ فَانْصَرَفَ إِلَى الْمَدِينَةِ، رَدَّ الْمُهَاجِرُونَ إِلَى الأَنْصَارِ مَنَائِحَهُمُ الَّتِي كَانُوا مَنَحُوهُمْ مِنْ ثِمَارِهِمْ فَرَدَّ النَّبِيُّ ﷺ إِلَى أُمِّهِ عِذَاقَهَا، وَأَعْطَى رَسُولُ اللَّهِ ﷺ أُمَّ أَيْمَنَ مَكَانَهُنَّ مِنْ حَائِطِهِ. [رواه البخاري: ٢٦٣٠]

**1171.** Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه demişdir: "Mühacirlər Məkkədən Mədinəyə gəldikdə onların heç nəyi yox idi. Ənsarın isə əkin sahələri və mülkləri var idi. Onda ənsar öz əkin sahələrini mühacirlərlə bölüşdü və bu sahələri onlara o şərtlə verdi ki, onlar bu əkin sahələrində işləyib ağaclara qulluq etsin, ənsar da hər il götürdüyü məhsulun yarısını onlara versin."

Ənəsin anası Ummu Suleym, Əbu Təlhənin oğlu Abdullahın da anası idi. O vaxt Ummu Suleym Peyğəmbərə ﷺ bir neçə xurma ağacı verdi. Peyğəmbər ﷺ də onu azad etdiyi cariyəsinə – Usamə ibn Zeydin anası Ummu Əymənə verdi.

Ənəs demişdir: "Peyğəmbər ﷺ xeybərlilərlə döyüşü başa çatdırıb Mədinəyə qayıtdıqdan sonra mühacirlər ənsarın verdikləri ağacları özlərinə qaytardılar. Həmçinin Peyğəmbər ﷺ Ummu Suleymin ağaclarını özünə qaytardı. Bunların yerinə Peyğəmbər ﷺ öz xurma bağının bir hissəsini Ummu Əymənə verdi" (əl-Buxari, 2630).

١١٧٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَرْبَعُونَ خَصْلَةً أَعْلاَهُنَّ مَنِيحَةُ الْعَنْزِ، مَا مِنْ عَامِلٍ يَعْمَلُ بِخَصْلَةٍ مِنْهَا رَجَاءَ ثَوَابِهَا وَتَصْدِيقَ مَوْعُودِهَا إِلاَّ أَدْخَلَهُ اللَّهُ بِهَا الْجَنَّةَ». [رواه البخاري: ٢٦٣١]

**1172.** Abdullah ibn Amr رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qırx yaxşılıq var ki, bunların ən üstünü, ehtiyacı olan kimsəyə (müvəqqəti olaraq südündən istifadə etmək üçün) sağmal keçi verməkdir. Hər kim savabını (Allahdan) umaraq və vəd olunanı təsdiq edərək bu yaxşılıqlardan birini yerinə yetirsə, Allah bunun sayəsində onu Cənnətə daxil edər." (əl-Buxari, 2631)

---

[1] 243-cü hədisin qeydlərinə bax.
[2] Bəyin qız otağına girdiyi birinci gecə.

شَيْءٍ». ثُمَّ إِنَّ عُرْوَةَ جَعَلَ يَرْمُقُ أَصْحَابَ النَّبِيِّ ﷺ بِعَيْنَيْهِ. قَالَ فَوَاللَّه مَا تَنَخَّمَ رَسُولُ اللَّه ﷺ نُخَامَةً إِلاَّ وَقَعَتْ فِى كَفِّ رَجُلٍ مِنْهُمْ فَدَلَكَ بِهَا وَجْهَهُ وَجِلْدَهُ، وَإِذَا أَمَرَهُمُ ابْتَدَرُوا أَمْرَهُ، وَإِذَا تَوَضَّأَ كَادُوا يَقْتَتِلُونَ عَلَى وَضُوئِه، وَإِذَا تَكَلَّمَ خَفَضُوا أَصْوَاتَهُمْ عِنْدَهُ، وَمَا يُحِدُّونَ إِلَيْهِ النَّظَرَ تَعْظِيمًا لَهُ، فَرَجَعَ عُرْوَةُ إِلَى أَصْحَابِه، فَقَالَ أَىْ قَوْمِ، وَاللَّه لَقَدْ وَفَدْتُ عَلَى الْمُلُوك، وَوَفَدْتُ عَلَى قَيْصَرَ وَكِسْرَى وَالنَّجَاشِىِّ وَاللَّه إِنْ رَأَيْتُ مَلِكًا قَطُّ ، يُعَظِّمُهُ أَصْحَابُهُ مَا يُعَظِّمُ أَصْحَابُ مُحَمَّد ﷺ مُحَمَّدًا، وَاللَّه إِنْ تَنَخَّمَ نُخَامَةً إِلاَّ وَقَعَتْ فِى كَفِّ رَجُلٍ مِنْهُمْ، فَدَلَكَ بِهَا وَجْهَهُ وَجِلْدَهُ، وَإِذَا أَمَرَهُمُ ابْتَدَرُوا أَمْرَهُ وَإِذَا تَوَضَّأَ كَادُوا يَقْتَتِلُونَ عَلَى وَضُوئِه، وَإِذَا تَكَلَّمَ خَفَضُوا أَصْوَاتَهُمْ عِنْدَهُ، وَمَا يُحِدُّونَ إِلَيْهِ النَّظَرَ تَعْظِيمًا لَهُ، وَإِنَّهُ قَدْ عَرَضَ عَلَيْكُمْ خُطَّةَ رُشْد، فَاقْبَلُوهَا. فَقَالَ رَجُلٌ مِنْ بَنِى كِنَانَةَ دَعُونِى آتِه. فَقَالُوا ائْتِه. فَلَمَّا أَشْرَفَ عَلَى النَّبِىِّ ﷺ وَأَصْحَابِه، قَالَ رَسُولُ اللَّه ﷺ: «هَذَا فُلاَنٌ، وَهُوَ مِنْ قَوْمٍ يُعَظِّمُونَ الْبُدْنَ فَابْعَثُوهَا لَهُ». فَبُعِثَتْ لَهُ وَاسْتَقْبَلَهُ النَّاسُ يُلَبُّونَ، فَلَمَّا رَأَى ذَلِكَ قَالَ سُبْحَانَ اللَّه مَا يَنْبَغِى لِهَؤُلاَءِ أَنْ يُصَدُّوا عَنِ الْبَيْت، فَلَمَّا رَجَعَ إِلَى أَصْحَابِه قَالَ رَأَيْتُ الْبُدْنَ قَدْ قُلِّدَتْ وَأُشْعِرَتْ، فَمَا أَرَى أَنْ يُصَدُّوا عَنِ الْبَيْت. فَقَامَ رَجُلٌ مِنْهُمْ يُقَالُ لَهُ مِكْرَزُ بْنُ حَفْص. فَقَالَ دَعُونِى آتِه. فَقَالُوا ائْتِه. فَلَمَّا أَشْرَفَ عَلَيْهِمْ قَالَ النَّبِىُّ ﷺ: «هَذَا مِكْرَزٌ وَهُوَ رَجُلٌ فَاجِرٌ». فَجَعَلَ يُكَلِّمُ النَّبِىَّ ﷺ، فَبَيْنَمَا هُوَ يُكَلِّمُهُ إِذْ جَاءَ سُهَيْلُ بْنُ عَمْرٍو. لَمَّا جَاءَ سُهَيْلُ بْنُ عَمْرٍو قَالَ النَّبِىُّ ﷺ: «لَقَدْ سَهُلَ لَكُمْ مِنْ أَمْرِكُمْ». فَجَاءَ سُهَيْلُ بْنُ عَمْرٍو فَقَالَ هَات، اكْتُبْ بَيْنَنَا وَبَيْنَكُمْ كِتَابًا، فَدَعَا النَّبِىُّ ﷺ الْكَاتِبَ، فَقَالَ النَّبِىُّ ﷺ: «بِسْمِ اللَّه الرَّحْمَنِ الرَّحِيمِ». قَالَ سُهَيْلٌ أَمَّا الرَّحْمَنُ فَوَاللَّه مَا أَدْرِى مَا هُوَ وَلَكِنِ اكْتُبْ بِاسْمِكَ اللَّهُمَّ . كَمَا كُنْتَ تَكْتُبُ. فَقَالَ الْمُسْلِمُونَ وَاللَّه لاَ نَكْتُبُهَا إِلاَّ بِسْمِ اللَّه الرَّحْمَنِ الرَّحِيمِ. فَقَالَ النَّبِىُّ ﷺ: «اكْتُبْ بِاسْمِكَ اللَّهُمَّ». ثُمَّ قَالَ: «هَذَا مَا قَاضَى عَلَيْهِ مُحَمَّدٌ رَسُولُ اللَّه». فَقَالَ سُهَيْلٌ وَاللَّه لَوْ كُنَّا نَعْلَمُ أَنَّكَ رَسُولُ اللَّه مَا صَدَدْنَاكَ عَنِ الْبَيْت وَلاَ قَاتَلْنَاكَ، وَلَكِنِ اكْتُبْ مُحَمَّدُ بْنُ عَبْد اللَّه. فَقَالَ النَّبِىُّ ﷺ: «وَاللَّه إِنِّى لَرَسُولُ اللَّه وَإِنْ كَذَّبْتُمُونِى. اكْتُبْ مُحَمَّدُ بْنُ عَبْد اللَّه». قَالَ الزُّهْرِىُّ وَذَلِكَ لِقَوْله: «لاَ يَسْأَلُونِى خُطَّةً يُعَظِّمُونَ فِيهَا حُرُمَات اللَّه إِلاَّ أَعْطَيْتُهُمْ إِيَّاهَا». فَقَالَ لَهُ النَّبِىُّ ﷺ: «عَلَى أَنْ تُخَلُّوا بَيْنَنَا وَبَيْنَ الْبَيْت فَنَطُوفَ بِه». فَقَالَ سُهَيْلٌ وَاللَّه لاَ تَتَحَدَّثُ الْعَرَبُ أَنَّا أُخِذْنَا ضُغْطَةً وَلَكِنْ ذَلِكَ مِنَ الْعَامِ الْمُقْبِلِ فَكَتَبَ. فَقَالَ سُهَيْلٌ وَعَلَى أَنَّهُ لاَ يَأْتِيكَ مِنَّا رَجُلٌ، وَإِنْ كَانَ عَلَى دِينِكَ، إِلاَّ رَدَدْتَهُ إِلَيْنَا. قَالَ الْمُسْلِمُونَ سُبْحَانَ اللَّه كَيْفَ يُرَدُّ إِلَى الْمُشْرِكِينَ وَقَدْ جَاءَ مُسْلِمًا فَبَيْنَمَا هُمْ كَذَلِكَ إِذْ دَخَلَ أَبُو جَنْدَلِ بْنُ سُهَيْلِ بْنِ عَمْرٍو يَرْسُفُ فِى قُيُودِه، وَقَدْ خَرَجَ مِنْ أَسْفَلِ مَكَّةَ، حَتَّى رَمَى بِنَفْسِه بَيْنَ أَظْهُرِ الْمُسْلِمِينَ. فَقَالَ سُهَيْلٌ هَذَا يَا مُحَمَّدُ أَوَّلُ مَا أُقَاضِيكَ عَلَيْهِ أَنْ تَرُدَّهُ إِلَىَّ. فَقَالَ النَّبِىُّ ﷺ: «إِنَّا لَمْ نَقْضِ الْكِتَابَ بَعْدُ». قَالَ فَوَاللَّه إِذًا لَمْ أُصَالِحْكَ عَلَى شَيْءٍ أَبَدًا. قَالَ النَّبِىُّ ﷺ: «فَأَجِزْهُ لِى». قَالَ مَا أَنَا بِمُجِيزِه لَكَ. قَالَ: «بَلَى، فَافْعَلْ». قَالَ مَا أَنَا بِفَاعِلٍ. قَالَ مِكْرَزٌ بَلْ قَدْ أَجَزْنَاهُ لَكَ. قَالَ أَبُو جَنْدَلٍ أَىْ مَعْشَرَ الْمُسْلِمِينَ، أُرَدُّ إِلَى الْمُشْرِكِينَ وَقَدْ جِئْتُ مُسْلِمًا أَلاَ تَرَوْنَ مَا قَدْ لَقِيتُ وَكَانَ قَدْ عُذِّبَ عَذَابًا شَدِيدًا فِى اللَّه. قَالَ فَقَالَ عُمَرُ بْنُ الْخَطَّاب فَأَتَيْتُ نَبِىَّ اللَّه ﷺ فَقُلْتُ أَلَسْتَ نَبِىَّ اللَّه حَقًّا قَالَ: «بَلَى». قُلْتُ أَلَسْنَا عَلَى الْحَقِّ وَعَدُوُّنَا عَلَى الْبَاطِلِ قَالَ: «بَلَى». قُلْتُ فَلِمَ نُعْطِى الدَّنِيَّةَ فِى دِينِنَا إِذًا قَالَ: «إِنِّى رَسُولُ اللَّه، وَلَسْتُ أَعْصِيه وَهُوَ نَاصِرِى». قُلْتُ أَوَلَيْسَ كُنْتَ تُحَدِّثُنَا أَنَّا سَنَأْتِى الْبَيْتَ فَنَطُوفُ بِه قَالَ: «بَلَى، فَأَخْبَرْتُكَ أَنَّا نَأْتِيه الْعَامَ». قَالَ قُلْتُ لاَ. قَالَ: «فَإِنَّكَ آتِيه وَمُطَّوِّفٌ بِه». قَالَ فَأَتَيْتُ أَبَا بَكْرٍ فَقُلْتُ يَا أَبَا بَكْرٍ، أَلَيْسَ هَذَا نَبِىَّ اللَّه حَقًّا قَالَ بَلَى. قُلْتُ أَلَسْنَا عَلَى الْحَقِّ وَعَدُوُّنَا عَلَى الْبَاطِلِ قَالَ بَلَى. قُلْتُ فَلِمَ نُعْطِى الدَّنِيَّةَ فِى دِينِنَا إِذًا قَالَ أَيُّهَا الرَّجُلُ، إِنَّهُ لَرَسُولُ اللَّه ﷺ وَلَيْسَ يَعْصِى رَبَّهُ وَهُوَ نَاصِرُهُ، فَاسْتَمْسِكْ بِغَرْزِه، فَوَاللَّه إِنَّهُ عَلَى الْحَقِّ. قُلْتُ أَلَيْسَ كَانَ يُحَدِّثُنَا أَنَّا سَنَأْتِى الْبَيْتَ وَنَطُوفُ

به قَالَ بَلَى، أَفَأَخْبَرَكَ أَنَّكَ تَأْتِيه الْعَامَ قُلْتُ لاَ. قَالَ فَإِنَّكَ آتِيه وَمُطَّوِّفٌ به. قَالَ الزُّهْرِيِّ قَالَ عُمَرُ فَعَمِلْتُ لِذَلِكَ أَعْمَالاً. قَالَ فَلَمَّا فَرَغَ مِنْ قَضِيَّةِ الْكِتَابِ قَالَ رَسُولُ اللَّهِ ﷺ لأَصْحَابِه: «قُومُوا فَانْحَرُوا، ثُمَّ احْلِقُوا». قَالَ فَوَاللَّه مَا قَامَ مِنْهُمْ رَجُلٌ حَتَّى قَالَ ذَلِكَ ثَلاَثَ مَرَّاتٍ، فَلَمَّا لَمْ يَقُمْ مِنْهُمْ أَحَدٌ دَخَلَ عَلَى أُمِّ سَلَمَةَ، فَذَكَرَ لَهَا مَا لَقِيَ مِنَ النَّاسِ. فَقَالَتْ أُمُّ سَلَمَةَ يَا نَبِيَّ اللَّه، أَتُحِبُّ ذَلِكَ اخْرُجْ ثُمَّ لاَ تُكَلِّمْ أَحَدًا مِنْهُمْ كَلِمَةً حَتَّى تَنْحَرَ بُدْنَكَ، وَتَدْعُوَ حَالِقَكَ فَيَحْلِقَكَ. فَخَرَجَ فَلَمْ يُكَلِّمْ أَحَدًا مِنْهُمْ، حَتَّى فَعَلَ ذَلِكَ نَحَرَ بُدْنَهُ، وَدَعَا حَالِقَهُ فَحَلَقَهُ. فَلَمَّا رَأَوْا ذَلِكَ، قَامُوا فَنَحَرُوا، وَجَعَلَ بَعْضُهُمْ يَحْلِقُ بَعْضًا، حَتَّى كَادَ بَعْضُهُمْ يَقْتُلُ بَعْضًا غَمًّا، ثُمَّ جَاءَهُ نِسْوَةٌ مُؤْمِنَاتٌ فَأَنْزَلَ اللَّهُ تَعَالَى: ﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِذَا جَآءَكُمُ ٱلۡمُؤۡمِنَٰتُ مُهَٰجِرَٰتٖ فَٱمۡتَحِنُوهُنَّۖ ﴾ حَتَّى بَلَغَ ﴿ بِعِصَمِ ٱلۡكَوَافِرِ ﴾ فَطَلَّقَ عُمَرُ يَوْمَئِذ امْرَأَتَيْنِ كَانَتَا لَهُ فِي الشِّرْكِ، فَتَزَوَّجَ إِحْدَاهُمَا مُعَاوِيَةُ بْنُ أَبِي سُفْيَانَ، وَالأُخْرَى صَفْوَانُ بْنُ أُمَيَّةَ، ثُمَّ رَجَعَ النَّبِيُّ ﷺ إِلَى الْمَدِينَةِ ، فَجَاءَهُ أَبُو بَصِيرٍ - رَجُلٌ مِنْ قُرَيْشٍ - وَهُوَ مُسْلِمٌ فَأَرْسَلُوا فِي طَلَبِه رَجُلَيْنِ، فَقَالُوا الْعَهْدَ الَّذِي جَعَلْتَ لَنَا. فَدَفَعَهُ إِلَى الرَّجُلَيْنِ ، فَخَرَجَا بِه حَتَّى بَلَغَا ذَا الْحُلَيْفَةِ، فَنَزَلُوا يَأْكُلُونَ مِنْ تَمْرٍ لَهُمْ، فَقَالَ أَبُو بَصِيرٍ لأَحَدِ الرَّجُلَيْنِ وَاللَّه إِنِّي لأَرَى سَيْفَكَ هَذَا يَا فُلاَنُ جَيِّدًا. فَاسْتَلَّهُ الآخَرُ فَقَالَ أَجَلْ، وَاللَّه إِنَّهُ لَجَيِّدٌ، لَقَدْ جَرَّبْتُ بِه ثُمَّ جَرَّبْتُ. فَقَالَ أَبُو بَصِيرٍ أَرِنِي أَنْظُرْ إِلَيْه، فَأَمْكَنَهُ مِنْهُ، فَضَرَبَهُ حَتَّى بَرَدَ، وَفَرَّ الآخَرُ، حَتَّى أَتَى الْمَدِينَةَ، فَدَخَلَ الْمَسْجِدَ يَعْدُو. فَقَالَ رَسُولُ اللَّه ﷺ حِينَ رَآهُ «لَقَدْ رَأَى هَذَا ذُعْرًا». فَلَمَّا انْتَهَى إِلَى النَّبِيِّ ﷺ قَالَ قُتِلَ وَاللَّه صَاحِبِي وَإِنِّي لَمَقْتُولٌ، فَجَاءَ أَبُو بَصِيرٍ فَقَالَ يَا نَبِيَّ اللَّه، قَدْ وَاللَّه أَوْفَى اللَّهُ ذِمَّتَكَ، قَدْ رَدَدْتَنِي إِلَيْهِمْ ثُمَّ أَنْجَانِي اللَّهُ مِنْهُمْ. قَالَ النَّبِيُّ ﷺ: «وَيْلُ أُمِّه مِسْعَرَ حَرْبٍ، لَوْ كَانَ لَهُ أَحَدٌ». فَلَمَّا سَمِعَ ذَلِكَ عَرَفَ أَنَّهُ سَيَرُدُّهُ إِلَيْهِمْ، فَخَرَجَ حَتَّى أَتَى سِيفَ الْبَحْرِ. قَالَ وَيَنْفَلِتُ مِنْهُمْ أَبُو جَنْدَلِ بْنُ سُهَيْلٍ، فَلَحِقَ بِأَبِي بَصِيرٍ، فَجَعَلَ لاَ يَخْرُجُ مِنْ قُرَيْشٍ رَجُلٌ قَدْ أَسْلَمَ إِلاَّ لَحِقَ بِأَبِي بَصِيرٍ، حَتَّى اجْتَمَعَتْ مِنْهُمْ عِصَابَةٌ، فَوَاللَّه مَا يَسْمَعُونَ بِعِيرٍ خَرَجَتْ لِقُرَيْشٍ إِلَى الشَّأْمِ إِلاَّ اعْتَرَضُوا لَهَا، فَقَتَلُوهُمْ، وَأَخَذُوا أَمْوَالَهُمْ، فَأَرْسَلَتْ قُرَيْشٌ إِلَى النَّبِيِّ ﷺ تُنَاشِدُهُ بِاللَّه وَالرَّحِمِ لَمَّا أَرْسَلَ، فَمَنْ أَتَاهُ فَهُوَ آمِنٌ، فَأَرْسَلَ النَّبِيُّ ﷺ إِلَيْهِمْ، فَأَنْزَلَ اللَّهُ تَعَالَى: ﴿ وَهُوَ ٱلَّذِي كَفَّ أَيۡدِيَهُمۡ عَنكُمۡ وَأَيۡدِيَكُمۡ عَنۡهُم بِبَطۡنِ مَكَّةَ مِنۢ بَعۡدِ أَنۡ أَظۡفَرَكُمۡ عَلَيۡهِمۡۚ ﴾ حَتَّى بَلَغَ: ﴿ ٱلۡحَمِيَّةَ حَمِيَّةَ ٱلۡجَٰهِلِيَّةِ ﴾ وَكَانَتْ حَمِيَّتُهُمْ أَنَّهُمْ لَمْ يُقِرُّوا أَنَّهُ نَبِيُّ اللَّه، وَلَمْ يُقِرُّوا بِبِسْمِ اللَّه الرَّحْمَنِ الرَّحِيمِ، وَحَالُوا بَيْنَهُمْ وَبَيْنَ الْبَيْتِ. [رواه البخاري: ٢٧٣١-٢٧٣٢]

**1190.** Misvər ibn Məxrəmə və Mərvan ibn Həkəm ﵄ bir-birinin rəvayətini təsdiqləyərək demişlər: "Peyğəmbər ﷺ Hudeybiyə sülhündə (Mədinədən səfərə) çıxdı və bir qədər yol getdikdən sonra əshabələrinə buyurdu ki: "Xalid ibn Vəlidin başçılıq etdiyi Qureyşin süvari qoşunu Ğəmim vadisində pusquda dayanıblar. Buna görə də, siz sağ tərəfə gedin!"

Allaha and olsun ki, Xalid Peyğəmbəri ﷺ və onun əshabələrini görmədi. Yalnız onların arxasınca qalxan qara toz-torpağı gördükdən sonra atını çaparaq (müsəlmanların gəldiyini) Qureyşə xəbər verməyə getdi. Peyğəmbər ﷺ isə (əshabələri ilə birlikdə) yoluna davam etdi. Nəhayət, gəlib Məkkəyə aparan (Hudeybiyyə vadisindəki) dağ yoluna çatdılar. Burada Peyğəmbərin ﷺ dəvəsi yerə çökdü və camaat: "Həl! Həl!"– deyə-deyə dəvəni yerindən tərpətməyə çalışdılar. Lakin dəvə çökdüyü yerdən qalxmadı və onlar: "Qəsva[1] inadkarlıq edib qalxmır!"– dedilər. Peyğəmbər ﷺ dedi: "Qəsva inadkarlıq et-

[1] Peyğəmbərin ﷺ dəvəsinin adı.

məz! Bu onun adəti deyil. Lakin (bir zamanlar Məkkəyə daxil olmaq istəyən) fili[1] tutub saxlayan Allah indi də Qəsvanı saxladı. Canım Əlində Olan Allaha and olsun ki, müşriklər Allahın haram buyurduqlarına riayət etməklə məndən hər nə istəsələr onlara istədiklərini verəcəyəm!" Sonra Peyğəmbər ﷺ Qəsvanı tərpətdi və heyvan dərhal ayağa qalxdı. Peyğəmbər ﷺ Hudeybiyyənin qurtaracağında yerləşən və içində az miqdarda su olan çuxurun yanına gəldi. Əshabələr çuxurda olan sudan az-az o qədər daşıyıb apardılar ki, orada su qalmadı. Onlar susuzluqdan Peyğəmbərə ﷺ şikayət etdikdə o, ox qabından bir ox çıxarıb onlara verdi və onu çuxura sancmağı əmr etdi. Allaha and olsun ki, ox çuxura sancılan kimi oradan su fəvvarə vurdu və bu fəvvarə onların susuzluqlarını yatırıb oradan qayıdanadək axmağa davam etdi. Bu vaxt Budeyl ibn Vərqa əl-Xuzai[2] öz qəbiləsindən – Xuzaədən olan bir dəstə kişi ilə Peyğəmbərin ﷺ yanına gəldi. Tihaməlilər[3] içərisində Xuzaə qəbiləsindən olanlar əvvəldən Peyğəmbərin ﷺ sirdaşı idilər. Budeyl dedi: "Mən Kəb ibn Lüeyyi və Amir ibn Lüeyyi Məkkədə tərk edib gəlmişəm. Onlar Hudeybiyyə vadisindəki ən zəngin su quyularını ələ keçiriblər. (Uzun müddət müqavimət göstərib qaçmamaq üçün) özləri ilə süd verən və balası yanında olan dişi dəvələr də gətiriblər. Səninlə müharibə etmək və Məkkəyə daxil olmağına mane olmaq istəyirlər." Peyğəmbər ﷺ dedi: "Biz müharibə etmək üçün gəlməmişik! Biz yalnız Ümrə ziyarəti etməyə gəlmişik. Həqiqətən, müharibə Qureyşi maddi və mənəvi cəhətdən zəiflətmiş, onları ziyana uğratmışdır. Əgər istəyirlərsə, müharibəni dayandırıb onlarla sülh müqaviləsi bağlayım. Qoy onda mənimlə digər insanlar arasında olan münasibətə qarışmasınlar. (Əgər mən o kafirlərə məğlub olsam, bu onlar üçün bir dəstək olacaq, yox) əgər qalib gəlsəm, onda onlar da digərləri kimi İslam dininə daxil ola bilərlər. Əks təqdirdə, mən onlarla bağladığım müqaviləni pozmayacağam. Beləliklə, onlar istirahət edəcəklər (bir müddət müharibədən yaxa qurtaracaqlar). Onlar mənim bu təklifimi qəbul etməyib bizim işimizə müdaxilə etsələr, canım Əlində olan Allaha and olsun ki, başım bədənimdən ayrılana qədər onlarla vuruşacağam. O zaman Allah Öz vədini (İslam dinini ucaldacağını) mütləq doğruldacaq."

Budeyl dedi: "Sənin dediklərini onlara çatdıraram!" Sonra o, qureyşlilərin yanına gəlib dedi: "Biz Peyğəmbərin ﷺ yanından gəlirik və ondan bəzi şeylər eşitdik. İstəyirsinizsə, onun dediklərini sizə ərz edək." Onların arasındakı səfehlər: "Ondan bizə hər hansı bir xəbər verməyinə ehtiyacımız yoxdur"- deyə etirazlarını bildirdilər. Ağıl sahibləri isə: "De görək, ondan nə eşitmisən!"– deyə israr etdilər. O: "Mən ondan filan, filan təklifləri eşitdim"– deyib, Peyğəmbərdən ﷺ eşitdiklərini bir-bir onlara nəql etdi. Sonra Urva ibn Məsud ayağa qalxıb dedi: "Ey qövmüm, siz mənim valideynim, mən də sizin övladınız deyiləmmi?" Onlar: "Bəli!"– deyə cavab verdilər. O yenə soruşdu: "Siz məni günah etməkdə ittiham edirsinizmi?" Onlar: "Xeyr!"– deyə cavab verdilər. O bir daha soruşdu: "Ukaz əhlini sizin köməyinizə çağırdığımı və onlar sizə yardım göstərməkdən imtina etdikdən sonra əhli-əyalımla,

---

[1] "Fil" surəsinə və onun təfsirinə bax.
[2] Budeyl Xuzaə qəbiləsinin başçısıdır.
[3] 444-cü hədisin qeydlərinə bax.

övladımla və mənə tabe olanlarla birlikdə sizə yardım etməyə gəldiyimi bilirsinizmi?" Onlar: "Əlbəttə, bilirik!"– deyə cavab verdilər. Urva dedi: "Həqiqətən, bu adam sizə xeyir, əmin-amanlıq və islah olunmağınızı təklif edir. Onun dəvətini qəbul edin və mənə də gedib onunla danışıq aparmağa izn verin!" Onlar: "Gedə bilərsən!"– deyə cavab verdilər. O, danışıq aparmaq üçün Peyğəmbərin ﷺ yanına gəldi. Peyğəmbər ﷺ Budeylə dediklərini Urvaya da dedi. Urva soruşdu: "Ey Muhəmməd! Əgər öz qövmünün kökünü kəssən, (kimi dəvət edəcəksən)? Heç səndən əvvəl ərəblərdən öz qövmünü məhv edən bir kəs barəsində eşitmisənmi? Bəs onlar sənə qalib gəlsələr necə? Allaha and olsun ki, mən sənin tərəfdarların arasında cəsarətli üzlər görmürəm. Mən burada bir çox insanlar görürəm ki, onlar səni müharibə başlayan kimi qoyub qaçacaqlar!" Əbu Bəkr (Urvanın bu təhqirinə dözməyib) dedi: "Get Latın[1] fərcini yala! Sən elə zənn edirsən ki, biz onu qoyub qaçacağıq?!" Urva: "Bu kimdir?"– deyə soruşdu. Əshabələr: "Bu, Əbu Bəkrdir!"- deyə cavab verdilər və o: "Canım Əlində Olana and olsun ki, bir zamanlar mənə göstərdiyin və əvəzini vermədiyim qayğı olmasaydı, sənin cavabını verərdim!"– deyib, Peyğəmbərlə ﷺ söhbətinə davam etdi. O, danışdıqca (hər dəfə söz söylədikdən sonra ərəblərin adətinə görə) Peyğəmbərin ﷺ saqqalından tuturdu. Bu vaxt Muğira ibn Şöbə əlində qılınc və başında dəmir dəbilqə Peyğəmbərin ﷺ yanında dayanıb onu qoruyurdu. Urva Peyğəmbərin ﷺ saqqalına əl atdıqca Muğira qılıncının qınının ucu ilə onun əlinə vurur və ona: "Peyğəmbərin ﷺ saqqalından əlini çək!"– deyirdi. Urva başını qaldırıb: "Bu kimdir?"- deyə soruşdu. Onlar: "Bu Şöbənin oğlu Muğiradır!"- deyə cavab verdilər. O, (Muğiraya) dedi: "Ey xain! Mən hələ də sənin xainliyin nəticəsində (Səqif qəbiləsi ilə aramızda) baş vermiş anlaşılmazlıqları həll etməklə məşğulam."

Cahiliyyət dövründə Muğira bir dəstə adamla[2] yol yoldaşı oldu. O zaman o onları öldürmüş, mallarını götürüb Peyğəmbərin ﷺ yanına gəlmiş və İslamı qəbul etmişdi. Peyğəmbər ﷺ isə ona belə demişdi: "İslam dininə daxil olduğunu səndən qəbul edirəm, lakin qəsb etdiyin malı götürmürəm!" Sonra Urva Peyğəmbərin ﷺ əshabələrinə nəzər saldı və (öz dostlarına) dedi: "Allaha and olsun ki, Peyğəmbərin ﷺ ağzından çıxan tüpürcək onlardan birinin ovucuna düşən kimi bu tüpürcəyi üzünə və bədəninə sürtür. Onlara bir şey əmr etdikdə dərhal onu yerinə yetirirlər. Dəstəmaz aldığı sudan (alıb qurtardıqdan sonra) əldə etmək üçün öz aralarında mübarizə aparırlar. Onun yanında danışarkən səslərini qaldırmırlar və hörmət əlaməti olaraq onun üzünə baxmırlar!" Sonra Urva tərəfdarlarının yanına qayıtdı və dedi: "Ay camaat! Allaha and olsun ki, mən bir nümayəndə kimi çox padşahların Qeysərin, Xosrovun, Nəcaşinin və başqalarının hüzurunda olmuşam və padşahların tərəfdarlarının onlara necə təzim etdiklərini də görmüşəm. Lakin Muhəmmədin ﷺ əshabələrinin ona təzim etdikləri kimi heç bir padşaha təzim olunduğunu görməmişəm. Allaha and olsun ki, Peyğəmbərin ﷺ ağzından çıxan hər bir tüpürcək onlardan birinin ovucuna düşsə, bu tüpürcəyi üzünə və bədəninə sürtürlər. Onlara bir şey əmr etdikdə dərhal onu yerinə

[1] Məkkəlilərin tapındıqları bütün adıdır.
[2] Burada Səqif qəbiləsindən olan Malik oğulları nəzərdə tutulur.

yetirirlər. Dəstəmaz aldığı sudan əldə etmək üçün öz aralarında mübarizə aparırlar. Onun yanında danışarkən səslərini qaldırmırlar və hörmət əlaməti olaraq onun üzünə baxmırlar! Həqiqətən, o sizə xeyir, əmin-amanlıq və islah olunmağınızı təklif edir. Onun təklifini qəbul edin!" Bənu Kinanədən olan bir nəfər dedi: "İzn verin mən gedib onunla danışım!" Onlar: "Gedə bilərsən!"- dedilər. O, əshabələrin yanına yaxınlaşdıqda Peyğəmbər ﷺ dedi: "Bu gələn filankəsdir. O elə bir tayfadandır ki, onlar qurbanlıq dəvələrinə çox hörmət edir və onları qiymətləndirirlər. Elə isə qurbanlıq dəvələrini ona tərəf sürün." Əshabələr dərhal qurbanlıq dəvələrini sürüb ləbbeyk deyə-deyə onu qarşıladılar. O, ləbbeyk deyə-deyə gələn əshabələri və qurbanlıq dəvələri gördükdə dedi: "Subhənallah! Onlar Allahın Evini ziyarət etməkdən məhrum olunmağa layiq deyillər." Sonra o, tərəfdarlarının yanına qayıdıb dedi: "Mən onların ümrə ziyarətində kəsəcəkləri, üzərilərində qurbanlıq nişanəsi olan dəvələrini gördüm. Düşünürəm ki, Allahın Evini ziyarət etməyə onlara mane olmamalıyıq." Bu vaxt Mikrəz ibn Həfs adlı bir nəfər ayağa qalxıb dedi: "İzn verin, mən gedib onunla danışım!" Onlar: "Gedə bilərsən!"– deilər. O, əshabələrin yanına yaxınlaşdıqda Peyğəmbər ﷺ dedi: "Bu gələn Mikrəzdır, o xain adamdır!" O, Peyğəmbərlə ﷺ söhbət etdiyi vaxt Suheyl ibn Amr onların yanına gəldi. Suheyl ibn Amr gəldikdə Peyğəmbər ﷺ əshabələrə dedi: "Artıq sizin bütün işləriniz yüngülləşdi!" Suheyl ibn Amr Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Gəl bizimlə sizin aranızda (on illik) sülh müqaviləsi bağlayaq!" Peyğəmbər ﷺ katibini çağırıb müqaviləni yazmağı ona əmr edib dedi: "Yaz! Mərhəmətli, Rəhmli Allahın adı ilə!" Suheyl ibn Amr dedi: Ər-Rəhmana gəldikdə isə, Allaha and olsun ki, mən onu tanımıram! Biz bir vaxtlar yazdığımız kimi yaz: "Allahım, Sənin adınla başlayıram!" Bu vaxt müsəlmanlar: "Allaha and olsun ki, biz yalnız "Bismillahir-Rəhmanir-Rəhim!" yazacağıq!"- deyə etiraz etdilər. Peyğəmbər ﷺ isə katibinə əmr edib dedi: "Yaz! Allahım, Sənin adınla başlayıram! Bu, Allahın elçisi Muhəmmədin bağladığı sülh müqaviləsidir..." Suheyl yenə etiraz edib dedi: "Əgər biz sənin Allahın elçisi olduğunu etiraf etsəydik, Onun Evini ziyarət etməyə sənə mane olmazdıq və səninlə vuruşmazdıq. Odur ki, yaz: "Muhəmməd ibn Abdullah!" Peyğəmbər ﷺ dedi: "Baxmayaraq ki, siz məni təkzib edirsiniz, amma, Allaha and olsun ki, həqiqətən, mən Allahın elçisiyəm!" Sonra da katibinə "Muhəmməd ibn Abdullah" yazmağı əmr etdi.

Zuhri demişdir: "Peyğəmbər ﷺ Suheylin dedikləri ilə razılaşdı. Çünki o: "Canım Əlində olan Allaha and olsun ki, müşriklər Allahın haram buyurduqlarına riayət etməklə məndən hər nə istəsələr, onlara istədiklərini verəcəyəm!"– deyə söz vermişdi".

Sonra Peyğəmbər ﷺ ona ilk şərtini təklif edib dedi: "Allahın Evini təvaf etməyə bizə əngəl törətməyəcəksiniz!" Suheyl dedi: "Xeyr! Allaha and olsun ki, bu dəfə təvaf etməyə sizə izn verməyəcəyik. Yoxsa ərəblər: "Müsəlmanlar bizim müqavimətimizi qırdılar və bizi məcbur etdilər"– deyə şayiələr buraxacaqlar. Odur ki, gələn ildən etibarən, (gəlib istədiyiniz qədər Allahın Evini ziyarət edə bilərsiniz)." Əli onun dediklərini yazdı. Sonra Suheyl ikinci şərti təklif edib dedi: "Bizim tərəfdən sənin yanına gələn hər bir kəsi, hətta sənin dinini qəbul etsə belə, geri qaytarmalısan!" Müsəlmanlar heyrətlə de-

dilər: “Subhənallah! Müsəlman olub yanımıza gəlmiş bir kimsə müşriklərə qaytarıla bilərmi?!” Onlar bu məsələni müzakirə edərkən, Əbu Cəndəl ibn Suheyl ibn Amr ayaqları qandallanmış vəziyyətdə onların yanına gəldi. (Əbu Cəndəl İslam dinini qəbul etdiyi üçün Məkkəlilər onu həbs etmişdilər). O, Məkkənin aşağısında həbs olunduğu yerdən qaçmış və nəhayət özünü müsəlmanlara çatdırmışdı. Bu vaxt Suheyl dedi: “Ey Muhəmməd! Bu müqavilənin ilk şərtinə əsasən onu mənə qaytarmalısan!” Peyğəmbər ﷺ dedi: “Biz hələ müqaviləni tamamlamamışıq.” Suheyl dedi: “Allaha and olsun ki, belə olduğu təqdirdə mən də sənin heç bir təklifinlə razılaşmayacağam!” Peyğəmbər ﷺ dedi: “Sən Əbu Cəndəli bu müqavilədən istisna et və onu mənə bağışla!” Suheyl dedi: “Mən onu qoyduğumuz şərtdən istisna edib sənə bağışlaya bilmərəm!” Peyğəmbər ﷺ: “Sən gəl razı ol, onu mənə bağışla!”- dedi. Suheyl qətiyyətlə rədd edib dedi: “Mən heç cür sənin dediyinə əməl edə bilmərəm.” Bu zaman Mikrəz dedi: “Yaxşı, onu özünüzdə saxlamağa sənə icazə verdik!” (Müqavilə bağlayan Suheyl ibn Amr isə buna razılıq vermədi). Bu vaxt Əbu Cəndəl dedi: “Ey müsəlmanlar! Mən müsəlman olub sığınacaq tapmaq üçün sizin yanınıza gəldim. İndi isə məni müşriklərə təhvil verirlər? Mənim əzab-əziyyətlərə məruz qaldığımı görmürsünüzmü?” O, Allah yolunda muşriklərin çox şiddətli işgəncələrinə məruz qalmışdı.

Ömər ibn Xəttab deyir ki, o zaman mən gəlib Peyğəmbərə ﷺ dedim: “Məgər sən Allahın haqq Peyğəmbəri deyilsənmi?” Peyğəmbər ﷺ: “Bəli!”– deyə cavab verdi. Mən dedim: “Məgər biz haqq yolunda, düşmənlərimiz isə batil yolda deyillərmi?” O yenə: “Bəli!”– dedi. Mən: “Elə isə nə üçün nöqsan və qüsurların dinimizə daxil olmasına imkan verməliyik?”– deyə soruşdum. O dedi: “Mən Allahın elçisiyəm və heç vaxt Ona asi olmuram! Allah mənə yardım edəcək!” Mən dedim: “Məgər sən bizə: “Bu yaxınlarda Allahın Evinə gedib onu təvaf edəcəyik!”– deyə xəbər verməmişdinmi?” O dedi: “Elədir! Məgər mən sənə məhz bu il təvaf edəcəyimizi xəbər vermişdim?” Mən: “Xeyr!”– deyə cavab verdikdə o dedi: “(Yaxın zamanda) sən mütləq gedib Kəbəni təvaf edəcəksən!” Sonra mən Əbu Bəkrin yanına gəlib dedim: “Ey Əbu Bəkr! Məgər o, Allahın haqq peyğəmbəri deyilmi?” O: “Elədir!”- deyə cavab verdi. Mən dedim: “Məgər biz haqq yolunda, düşmənlərimiz isə batil yolda deyillərmi?” O: “Elədir!”– deyə cavab verdi. Mən: “Elə isə nə üçün nöqsan və qüsurların dinimizə daxil olmasına imkan verməliyik?”– dedim. Əbu Bəkr dedi: “Ey insan! Həqiqətən, o, Allahın elçisidir və heç vaxt Rəbbinə asi olmur. Allah onun yardımçısıdır. Elə isə ondan yapış (əmr və qadağalarına riayət et). Allaha and olsun ki, o haqq yoldadır.” Mən dedim: “Məgər o bizə: “Bu yaxınlarda Allahın Evinə gedib onu təvaf edəcəyik”– deyə xəbər verməmişdimi?” Əbu Bəkr dedi: “Elədir! Məgər o sənə məhz bu il təvaf edəcəyini xəbər vermişdi?” Mən: “Xeyr!”– dedikdə o dedi: “(Yaxın zamanda) sən mütləq gedib Kəbəni təvaf edəcəksən!”

Ömər demişdir: “Mən çoxlu xeyirxah işlər gördüm (ki, Allah etdiyim səhvi bağışlasın).”

Peyğəmbər ﷺ sülh müqaviləsini bağladıqdan sonra əshabələrinə: “Qalxın, qurbanlarınızı kəsin, başınızı qırxdırın!”- deyə əmr etdi.” Allaha and olsun ki, Peyğəmbər ﷺ bunu üç dəfə təkrar etdi, lakin əshabələrdən heç biri

ayağa qalxmadı. Əshabələrin yerlərindən tərpənmədiyini görən Peyğəmbər ﷺ Ummu Sələmənin yanına gəldi və onların bu etinasızlığını ona xəbər verdi. Ummu Sələmə dedi: "Ey Allahın elçisi! İstəyirsən, onlar sənin əmrinə tabe olsunlar?! Bayıra çıx, sonra qurbanlıq dəvələrini kəsməyincə və dəlləyini çağırıb başını qırxdırmayınca onlara bir kəlmə belə demə!" O, bayıra çıxıb qurbanlıq dəvələrini kəsdi, dəlləyini çağırıb başını qırxdırdı və onlara heç bir söz demədi! Bunu görən əshabələr dərhal qalxıb qurbanlıq dəvələrini kəsdilər və bir-birilərinin başlarını qırxmağa başladılar. Hətta iş o yerə çatdı ki, (onun əmrini daha tez yerinə yetirmək üçün baş vermiş dartışma nəticəsində) əshabələr bilmədən az qala bir-birilərini öldürmüşdülər. Sonra mömin qadınlar Peyğəmbərin ﷺ yanına hicrət etdilər və Uca Allah bu ayəni nazil etdi: "Ey iman gətirənlər! Mömin qadınlar hicrət edib sizin yanınıza gəldikləri zaman onları imtahana çəkin. Allah onların imanını daha yaxşı bilir. Əgər bunların mömin olduqlarını bilsəniz, onları kafirlərə qaytarmayın. Nə bunlar onlara halaldır, nə də onlar bunlara halaldırlar. *Kafirlərin bu qadınlara* sərf etdikləri mehri özlərinə qaytarın. *Həmin* qadınların mehrlərini özlərinə verdiyiniz halda, onlarla evlənməyinizdə sizə heç bir günah yoxdur. Kafir qadınlarınızı kəbin altında saxlamayın, sərf etdiyiniz mehri tələb edin. Qoy onlar da *mömin qadınlara* sərf etdikləri mehri *sizdən* tələb etsinlər. Allahın hökmü budur. O sizin aranızda hökm verir. Allah Biləndir, Müdrikdir."[1] Bu ayə nazil olduqdan sonra Ömər iki müşrik zövcəsini boşadı və onlardan birini Müaviyə ibn Əbu Süfyan, digərini isə Səfvan ibn Ümeyyə aldı. Peyğəmbər ﷺ Mədinəyə gəldikdən sonra, müsəlman olmuş qureyşli Əbu Bəsir onun yanına gəldi. Qureyşlilər onu geri qaytarmaq üçün iki adam göndərdi və onlar Peyğəmbərin ﷺ yanına gəlib: "Bizimlə bağladığın sülh müqaviləsinə əsasən Əbu Bəsiri geri qaytar!"- deyə ona müraciət etdilər. O, Əbu Bəsiri həmin iki nəfərə təhvil verdi. Onlar Əbu Bəsirlə Məkkəyə yola düşdülər və nəhayət gəlib zül-Hüleyfəyə çatdılar. Burada onlar (xurcunlarındakı) xurmadan yemək üçün dayandılar. Əbu Bəsir onlardan birinə: "Ey filankəs, Vallahi ki, sənin bu qılıncın çox gözəldir!"– dedi. Qılıncın sahibi onu qınından çıxarıb dedi: "Doğrudan da, bu çox gözəl qılıncdır. Mən onu bir neçə dəfə təcrübədən keçirmişəm." Əbu Bəsir: "Göstər görüm necə qılıncdır"- dedi, sonra da fürsət tapıb qılıncı onun əlindən aldı və onun nəfəsini kəsənədək qılıncla onu vurdu. O birisi isə qaçıb Mədinəyə gəldi və tələsik məscidə daxil oldu. Peyğəmbər ﷺ onun vahimə içində yüyürə-yüyürə gəldiyini görüb: "Bu adam nədənsə qorxub!"– dedi. O, Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Vallahi, yoldaşım öldürüldü! (Məni qorumasanız) mən də öldürüləcəyəm." Bu vaxt Əbu Bəsir gəlib dedi: "Ey Allahın peyğəmbəri! Allaha and olsun ki, O, sənə vədini yerinə yetirməyə yardım etdi və sən də məni müşriklərə təhvil verdin. Sonra isə Allah məni onların əlindən xilas etdi. Peyğəmbər ﷺ dedi: "Vay bunun anasının halına! Bu, müharibə alovunu qızışdıran bir kimsədir. Əgər bir neçə nəfər də onunla həmrəy olsa, (o zaman müharibə alovu qızışacaq və sülh müqaviləsi pozulacaqdır)." Əbu Bəsir bunu eşitdikdə yenidən müşriklərə qaytarılacağını başa düşdü və Mədinədən çıxıb dənizin sahilinə tərəf

[1] "əl-Mumtəhənə" surəsi, 10.

getdi. Sonra müşriklərdən canını qurtarmış Əbu Cəndəl ibn Suheyl də gəlib ona qoşuldu. Daha sonra Məkkə müşriklərindən yaxa qurtaran hər bir müsəlman ona qoşuldu və beləliklə də, onlar qüvvətli bir dəstəyə çevrildilər. Vallahi, onlar hər dəfə Qureyşin ticarət karvanının Şama yola düşdüyündən xəbər tutduqda, karvanın qabağını kəsir və onları öldürüb mallarını götürürdülər. (Bu təhlükəni görən) Qureyş öz tərəfindən bir nümayəndəni Peyğəmbərin ﷺ yanına göndərdi. Bu dəfə qureyşlilər Peyğəmbəri ﷺ Allaha and verib aralarında olan qohumluq əlaqələrinin hörmətinə görə (onların ticarət karvanlarını Əbu Bəsir və onun camaatından qorumaq üçün) ona yalvarırdı. Onlar Peyğəmbərə ﷺ: "(Bundan sonra müsəlman olaraq Məkkədən Mədinəyə) hicrət etmiş hər bir şəxs geri gətirilməyəcəkdir"- deyə xəbər göndərmişdilər." Peyğəmbər ﷺ əshabələrdən birini Əbu Bəsirin və onun camaatının yanına göndərdi və Uca Allah bu ayələri nazil etdi: "Sizi onların üzərində qələbə çalmağa müvəffəq etdikdən sonra, Məkkə vadisində onların əlini sizdən, sizin də əlinizi onlardan çəkən Odur. Allah sizin nə etdiklərinizi Görəndir. O kafirlər, sizi Məscidul-Hərama buraxmayan və qurbanlıq heyvanlarını qurbangaha gedib çatmağa qoymayan kimsələrdir. Əgər *Məkkədə* tanımadığınız mömin kişiləri və mömin qadınları bilmədən tapdalayıb əzmək və onların ucbatından günaha batmaq təhlükəsi ilə qarşılaşmasaydınız, *Allah ora zorla girməyinizə izin verərdi.* Lakin Allah istədiyini Öz mərhəmətinə qovuşdursun deyə *buna izin vermədi.* Əgər onlar bir-birindən seçilsəydilər, Biz onlardan kafir olanlara ağrılı-acılı bir əzab verərdik. Kafirlər öz qəlbində təkəbbürlüyə – cahillik lovğalığına qapıldıqları zaman Allah Öz Elçisinə və möminlərə *mənəvi* rahatlıq nazil etdi və onlara təqva sözünü vacib buyurdu. Onların buna daha çox haqqı var idi və ona layiq idilər. Allah hər şeyi bilir"[1].

Onların təkəbbür və təəssübü (Hudeybiyə müqaviləsində) "Mərhəmətli, Rəhmli Allahın adı ilə!", "Allahın elçisi" sözlərini yazmaqdan imtina etmələri və həmin il müsəlmanların Məkkəyə daxil olub, Allahın evini ziyarət etməyə razılıq verməmələri idi." (əl-Buxari, 2731-2732)

## 5-ci fəsil. Qərar qəbul edildikdə hansı şərtləri qoymaq və nəyi istisna etmək olar

## ٥– باب: مَا يَجُوزُ مِنَ الاِشْتِرَاطِ وَالثُّنْيَا فِى الإِقْرَارِ

١١٩١ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِنَّ لِلَّهِ تِسْعَةً وَتِسْعِينَ اسْمًا مِائَةً إِلاَّ وَاحِدًا مَنْ أَحْصَاهَا دَخَلَ الْجَنَّةَ». [رواه البخاري: ٢٧٣٦]

**1191.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahın doxsan doqquz – yüzdən bir əskik – adı var. Kim onları sadalasa, Cənnətə daxil olar." (əl-Buxari, 2736)

---

[1] "əl-Fəth" surəsi, 24-26.

# ٥٥ – كِتَابُ الوَصَايَا

# 55 – Vəsiyyətlər kitabı

## ١ – باب: الْوَصَايَا

## 1-ci fəsil. Vəsiyyətlər

١١٩٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﭭ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَا حَقُّ امْرِئٍ مُسْلِمٍ لَهُ شَىْءٌ، يُوصِى فِيهِ يَبِيتُ لَيْلَتَيْنِ، إِلاَّ وَوَصِيَّتُهُ مَكْتُوبَةٌ عِنْدَهُ». [رواه البخاري: ٢٧٣٨]

**1192.** Abdullah ibn Ömər ﭭ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Vəsiyyət etməyə bir şeyi olan bir müsəlmanın (başının altında) yazılı bir vəsiyyəti olmayınca (ardıcıl) iki gecə keçirməyə haqqı yoxdur." (əl-Buxari, 2738)

١١٩٣ – عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ﭬ خَتَنِ رَسُولِ اللَّهِ ﷺ أَخِى جُوَيْرِيَةَ بِنْتِ الْحَارِثِ قَالَ مَا تَرَكَ رَسُولُ اللَّهِ ﷺ عِنْدَ مَوْتِهِ دِرْهَمًا وَلاَ دِينَارًا وَلاَ عَبْدًا وَلاَ أَمَةً وَلاَ شَيْئًا، إِلاَّ بَغْلَتَهُ الْبَيْضَاءَ وَسِلاَحَهُ وَأَرْضًا جَعَلَهَا صَدَقَةً. [رواه البخاري: ٢٧٣٩]

**1193.** Rəvayət edilir ki, Peyğəmbərin ﷺ qayını, Cuveyriya bint Harisin ﭭ qardaşı Amr ibn Haris demişdir: "Peyğəmbər ﷺ vəfat etdikdə nə bir dirhəm, nə bir dinar, nə bir kölə, nə bir kəniz, nə də (başqa) bir şey qoyub getmişdir. Qoyub getdiyi ancaq ağ qatır, silahı və sədəqə verdiyi torpaq olmuşdur." (əl-Buxari, 2739)

١١٩٤ – عَنْ طَلْحَةَ بْنِ مُصَرِّفٍ قَالَ: سَأَلْتُ عَبْدَ اللَّهِ بْنَ أَبِى أَوْفَى ﭭ هَلْ كَانَ النَّبِىُّ ﷺ أَوْصَى فَقَالَ لاَ. فَقُلْتُ كَيْفَ كُتِبَ عَلَى النَّاسِ الْوَصِيَّةُ أَوْ أُمِرُوا بِالْوَصِيَّةِ قَالَ أَوْصَى بِكِتَابِ اللَّهِ. [رواه البخاري: ٢٧٤٠]

**1194.** Rəvayət edilir ki, Təlhə ibn Müsərrif demişdir: "Mən Abdullah ibn Əbu Əufədən soruşdum: "Peyğəmbər ﷺ vəsiyyət etmişdirmi?" O: "Xeyr!"– deyə cavab verdi. Mən soruşdum: "Bəs nə üçün insanlara vəsiyyət yazmaq əmr edilmişdir?!" O dedi: "Peyğəmbər ﷺ Allahın Kitabını[1] vəsiyyət etmişdir." (əl-Buxari, 2740)

## ٢ – باب: الصَّدَقَةُ عِنْدَ الْمَوْتِ

## 2-ci fəsil. Ölüm ayağında sədəqə vermək

١١٩٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﭬ قَالَ: قَالَ رَجُلٌ لِلنَّبِىِّ ﷺ يَا رَسُولَ اللَّهِ، أَىُّ الصَّدَقَةِ أَفْضَلُ قَالَ: «أَنْ تَصَدَّقَ وَأَنْتَ صَحِيحٌ حَرِيصٌ. تَأْمُلُ الْغِنَى، وَتَخْشَى الْفَقْرَ، وَلاَ تُمْهِلْ حَتَّى إِذَا بَلَغَتِ الْحُلْقُومَ قُلْتَ لِفُلاَنٍ كَذَا وَلِفُلاَنٍ كَذَا، وَقَدْ كَانَ لِفُلاَنٍ». [رواه البخاري: ٢٧٤٨]

**1195.** Rəvayət edilir ki, Əbu Hureyra ﭬ demişdir: "(Bir dəfə) bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "Ya Rəsulullah, hansı sədəqə daha fəzilətlidir?" Peyğəmbər ﷺ buyurdu: "Bu, sənin sağlam və həris olduğun, kasıblamaqdan ehtiyat etdiyin və varlanacağına ümid bəslədiyin halda verdiyin sədəqədir. Bir də

[1] Yəni insanlara Quranda yazılanları oxuyub ona əməl etməyi vəsiyyət etmişdir.

ki, sədəqə verməyi, canın boğazına yetişənədək, özün də: "(malımdan) filankəsə bu qədər, filankəsə də bu qədər" (verin deyə vəsiyyət edəcəyin) vaxta saxlama. (Çünki) həmin vaxt (mal-dövlətin) filankəsə (miras) qalacaq." (əl-Buxari, 2748)

## ٣ – باب: هَلْ يَدْخُلُ النِّسَاءُ وَالْوَلَدُ فِى الأَقَارِبِ؟

## 3-cü fəsil. Qadınlar və övladlar qohum-əqrəbaya aiddirmi?

١١٩٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ قَامَ رَسُولُ اللَّه ﷺ حِينَ أَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ: ﴿وَأَنذِرْ عَشِيرَتَكَ ٱلْأَقْرَبِينَ﴾ قَالَ: «يَا مَعْشَرَ قُرَيْش – أَوْ كَلِمَةً نَحْوَهَا – اشْتَرُوا أَنْفُسَكُمْ، لاَ أُغْنِى عَنْكُمْ مِنَ اللَّه شَيْئًا، يَا بَنِى عَبْد مَنَاف لاَ أُغْنِى عَنْكُمْ مِنَ اللَّه شَيْئًا، يَا عَبَّاسُ بْنَ عَبْد الْمُطَّلب لاَ أُغْنِى عَنْكَ مِنَ اللَّه شَيْئًا، وَيَا صَفيَّةُ عَمَّةَ رَسُولِ اللَّه لاَ أُغْنِى عَنْكِ مِنَ اللَّه شَيْئًا، وَيَا فَاطِمَةُ بِنْتَ مُحَمَّدٍ سَلِينِى مَا شِئْتِ مِنْ مَالِى لاَ أُغْنِى عَنْكِ مِنَ اللَّه شَيْئًا». [رواه البخاري: ٢٧٥٣]

**1196.** Əbu Hureyra ﷺ rəvayət edir ki, qüdrətli və əzəmətli Allah: "Ən yaxın qohumlarını qorxut!"[1] ayəsini nazil etdikdə Peyğəmbər ﷺ (qohum-əqrəbasını çağırıb) dedi: "Ey quyerşlilər, canınızı satın alın!"[2] Mən sizi Allahın (əzabından) qurtara bilməyəcəyəm. Ey Abdumənaf oğulları, mən sizi Allahın (əzabından) qurtara bilməyəcəyəm. Ey Abbas ibn Abdulmuttəlib, mən səni Allahın (əzabından) qurtara bilməyəcəyəm. Ey Peyğəmbərin bibisi Səfiyyə, mən səni Allahın (əzabından) qurtara bilməyəcəyəm. Ey Muhəmmədin qızı Fatimə, malımdan nə istəyirsənsə, istə. Mən səni Allahın (əzabından) qurtara bilməyəcəyəm. (əl-Buxari, 2753)

## ٤ – باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَٱبْتَلُواْ ٱلْيَتَٰمَىٰ حَتَّىٰٓ إِذَا بَلَغُواْ ٱلنِّكَاحَ فَإِنْ ءَانَسْتُم مِّنْهُمْ رُشْدًا فَٱدْفَعُوٓاْ إِلَيْهِمْ أَمْوَٰلَهُمْ . . .﴾

## 4-cü fəsil. Uca Allahın: "Yetimlər yetkinlik yaşına çatdıqda onları imtahana çəkin. Əgər onların yetkinliyə çatdıqlarını görsəniz, mallarını özlərinə qaytarın..."[3] sözü haqqında

١١٩٧ – عَنْ ابْنِ عُمَرَ ﷺ أَنَّ عُمَرَ تَصَدَّقَ بِمَالٍ لَهُ عَلَى عَهْد رَسُول اللَّه ﷺ وَكَانَ يُقَالُ لَهُ ثَمْغٌ، وَكَانَ نَخْلاً، فَقَالَ عُمَرُ يَا رَسُولَ اللَّه إِنِّى اسْتَفَدْتُ مَالاً وَهُوَ عِنْدى نَفِيسٌ فَأَرَدْتُ أَنْ أَتَصَدَّقَ بِه. فَقَالَ النَّبِىُّ ﷺ: «تَصَدَّقْ بِأَصْلِه، لاَ يُبَاعُ وَلاَ يُوهَبُ وَلاَ يُورَثُ، وَلَكِنْ يُنْفَقُ ثَمَرُهُ». فَتَصَدَّقَ بِه عُمَرُ، فَصَدَقَتُهُ ذَلِكَ فِى سَبِيلِ اللَّه وَفِى الرِّقَاب وَالْمَسَاكِين وَالضَّيْف وَابْنِ السَّبِيلِ وَلِذِى الْقُرْبَى، وَلاَ جُنَاحَ عَلَى مَنْ وَلِيَهُ أَنْ يَأْكُلَ مِنْهُ بِالْمَعْرُوف، أَوْ يُوكِلَ صَدِيقَهُ غَيْرَ مُتَمَوِّلٍ بِه. [رواه البخاري: ٢٧٦٤]

---

[1] "əş-Şuəra" surəsi, 214.
[2] Yəni canınızı Allahın əzabından qurtarın.
[3] "ən-Nisa" surəsi, 6.

**1197.** İbn Ömər ﷺ rəvayət edir ki, Ömər ﷺ Səmğ adlanan xurmalığını Peyğəmbərin ﷺ zamanında sədəqə verdi. (Bunu verməmişdən əvvəl) Ömər Peyğəmbərə ﷺ dedi: "Ya Rəsulullah, mənim çox dəyərli olan bir malım var və mən onu sədəqə vermək istəyirəm." Peyğəmbər ﷺ buyurdu: "Əslini[1] sədəqə ver ki, nə satılsın, nə hədiyyə verilsin, nə də miras qalsın. Ancaq meyvəsi paylanılsın." Beləliklə, Ömər o xurmalığı sədəqə verdi (ki, onun meyvəsindən) Allah yolunda (vuruşanlara), kölələrin azad edilməsinə, kasıblara, qonaqlara, müsafirlərə və qohumlara verilsin. (Xurmaları) paylaşdıran kimsə ondan qaydasında yesə və ya onu mənimsəməmək şərtilə dostlarına yedirtsə (ona) günah sayılmaz. (əl-Buxari, 2764)

## ٥- باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿إِنَّ ٱلَّذِينَ يَأْكُلُونَ أَمْوَٰلَ ٱلْيَتَٰمَىٰ ظُلْمًا إِنَّمَا يَأْكُلُونَ فِى بُطُونِهِمْ نَارًا ۖ وَسَيَصْلَوْنَ سَعِيرًا﴾

## 5-ci fəsil. Uca Allahın: "Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlər öz qarınlarına ancaq od doldururlar və onlar yandırıb-yaxan oda girəcəklər."[2] sözü haqqında

١١٩٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «اجْتَنِبُوا السَّبْعَ الْمُوبِقَاتِ». قَالُوا يَا رَسُولَ اللَّهِ، وَمَا هُنَّ قَالَ: «الشِّرْكُ بِاللَّهِ، وَالسِّحْرُ، وَقَتْلُ النَّفْسِ الَّتِى حَرَّمَ اللَّهُ إِلاَّ بِالْحَقِّ، وَأَكْلُ الرِّبَا، وَأَكْلُ مَالِ الْيَتِيمِ، وَالتَّوَلِّى يَوْمَ الزَّحْفِ، وَقَذْفُ الْمُحْصَنَاتِ الْمُؤْمِنَاتِ الْغَافِلاَتِ». [رواه البخاري: ٢٧٦٦]

**1198.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məhvedici yeddi günahdan çəkinin!" (Əshabələr) soruşdular: "Nədir onlar, ya Rəsulullah?" Peyğəmbər ﷺ buyurdu: "Allaha şərik qoşmaq, sehrbazlıq, Allahın haram buyurduğu cana nahaq yerə qəsd etmək, sələm yemək, yetimin malını yemək, döyüş meydanından qaçmaq və (zinadan) xəbəri olmayan namuslu, ismətli mömin qadınları zinada ittiham etmək." (əl-Buxari, 2766)

## ٦- باب: نَفَقَةُ الْقَيِّمِ لِلْوَقْفِ

## 6-cı fəsil. Vəqfi[3] idarə edən kimsənin zəhmət haqqı

١١٩٩ – عَنِ ابْنِ عُمَرَ ﷺ أَنَّ عُمَرَ اشْتَرَطَ فِى وَقْفِهِ أَنْ يَأْكُلَ مَنْ وَلِيَهُ وَيُوكِلَ صَدِيقَهُ غَيْرَ مُتَمَوِّلٍ مَالاً. [رواه البخاري: ٢٧٧٦]

**1199.** İbn Ömər ﷺ rəvayət edir ki, Ömər (öz bağını) vəqf edərkən (xurmaları) paylaşdıran kimsənin ondan yeməyinə və ya onu mənimsəməmək məqsədilə dostlarına yedirtməyinə dair şərt kəsmişdir. (əl-Buxari, 2776)

---

[1] Söhbət xurma ağaclarını vəqf etməkdən gedir.
[2] "ən-Nisa" surəsi, 10.
[3] 745-ci hədisin qeydlərinə bax.

**7-ci fəsil.**
**Bir torpağı və ya su quyusunu vəqf edən kimsənin, müsəlmanların bundan faydalandığı qədər özünün də faydalanmasına dair şərt qoyması**

٧– باب:
إِذَا وَقَفَ أَرْضًا أَوْ بِئْرًا وَاشْتَرَطَ لِنَفْسِهِ مِثْلَ دِلاَءِ الْمُسْلِمِينَ

١٢٠٠ – عَنْ عُثْمَانَ ﷺ حَيْثُ حُوصِرَ أَشْرَفَ عَلَيْهِمْ وَقَالَ أَنْشُدُكُمْ وَلاَ أَنْشُدُ إِلاَّ أَصْحَابَ النَّبِيِّ ﷺ، أَلَسْتُمْ تَعْلَمُونَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَنْ حَفَرَ رُومَةَ فَلَهُ الْجَنَّةُ». فَحَفَرْتُهَا، أَلَسْتُمْ تَعْلَمُونَ أَنَّهُ قَالَ: «مَنْ جَهَّزَ جَيْشَ الْعُسْرَةِ فَلَهُ الْجَنَّةُ». فَجَهَّزْتُهُمْ. قَالَ فَصَدَّقُوهُ بِمَا قَالَ. [رواه البخاري: ٢٧٧٨]

**1200.** (Əbu Abdur-Rəhman əs-Suləmi) rəvayət edir ki, (xəvariclər[1]) Osmanı ﷺ mühasirəyə aldıqda Osman onlara baxıb dedi: “Sizi and verirəm Allaha və (Allah xatirinə) ancaq Peyğəmbərin ﷺ əshabələrinə müraciət edirəm. Məgər bilmirsiniz ki, Peyğəmbər ﷺ: “Kim Rumə quyusunu alsa, onun üçün Cənnət vardır”– deyə buyurmuş, mən də o quyunu satın almışdım?! Məgər bilmirsiniz ki, Peyğəmbər ﷺ: “Kim çətin ordunu[2] təchiz etsə, onun üçün Cənnət vardır”– deyə buyurmuş, mən də həmin ordunu təchiz etmişdim?” Xəvariclər onun dediyini təsdiq etdilər. (əl-Buxari, 2778)

**8-ci fəsil.**
**Uca Allahın: “Ey iman gətirənlər! Sizlərdən bir kimsəyə ölüm gəldiyi zaman, vəsiyyət vaxtı içinizdən iki ədalətli kişi, bir yerə səfərə çıxdığınız zaman başınıza ölüm müsibəti gəldikdə isə özünüzdən olmayan iki kişi aranızda şahidlik etsin...” ayəsindən “...Allah günahkar tayfanı doğru yola yönəltməz.”[3] ayəsinə qədər**

٨– باب: قَوْلُ اللَّهِ تَعَالَى:
﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ شَهَٰدَةُ بَيۡنِكُمۡ إِذَا حَضَرَ أَحَدَكُمُ ٱلۡمَوۡتُ حِينَ ٱلۡوَصِيَّةِ ٱثۡنَانِ ذَوَا عَدۡلٖ مِّنكُمۡ أَوۡ ءَاخَرَانِ مِنۡ غَيۡرِكُمۡ ﴾ ... إِلَى قَوْلِهِ: ﴿ وَٱللَّهُ لَا يَهۡدِي ٱلۡقَوۡمَ ٱلۡفَٰسِقِينَ ﴾

١٢٠١ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ خَرَجَ رَجُلٌ مِنْ بَنِي سَهْمٍ مَعَ تَمِيمٍ الدَّارِيِّ وَعَدِيِّ بْنِ بَدَّاءٍ فَمَاتَ السَّهْمِيُّ بِأَرْضٍ لَيْسَ بِهَا مُسْلِمٌ، فَلَمَّا قَدِمَا بِتَرِكَتِهِ فَقَدُوا جَامًا مِنْ فِضَّةٍ مُخَوَّصًا مِنْ ذَهَبٍ، فَأَحْلَفَهُمَا رَسُولُ اللَّهِ ﷺ، ثُمَّ وُجِدَ الْجَامُ بِمَكَّةَ فَقَالُوا ابْتَعْنَاهُ مِنْ تَمِيمٍ وَعَدِيٍّ. فَقَامَ رَجُلاَنِ مِنْ أَوْلِيَائِهِ، فَحَلَفَا لَشَهَادَتُنَا أَحَقُّ مِنْ شَهَادَتِهِمَا، وَإِنَّ الْجَامَ لِصَاحِبِهِمْ. قَالَ وَفِيهِمْ نَزَلَتْ هَذِهِ الآيَةُ: ﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ شَهَٰدَةُ بَيۡنِكُمۡ ﴾. [رواه البخاري: ٢٧٨٠]

[1] 627-ci hədisin qeydlərinə bax.
[2] Bu ordu çətin bir döyüşə hazırlaşdığı üçün Peyğəmbər ﷺ onu “çətin ordu” adlandırmışdır. Söhbət Təbuk döyüşündən gedir. “ət-Tovbə” surəsinin 117-ci ayəsinə və onun təfsirinə bax.
[3] “əl-Maidə” surəsi, 106-108.

**1201.** İbn Abbas ﵄ rəvayət edir ki, Bənu Səhm qəbiləsindən olan bir (müsəlman) Təmim ibn Ovs əd-Dari və Adiy ibn Bədda ilə birlikdə səfərə çıxmışdı. (Nəhayət, gəlib) müsəlman olmayan bir diyara çatdıqda səhmli vəfat etdi. Yoldaşları onun qoyub getdiyi mirası geri gətirdikləri zaman üzərinə qızıl örtük çəkilmiş gümüş camı itirdilər. Peyğəmbər ﷺ də onlara, həqiqətən də, camı itirdiklərinə dair and içməyi əmr etdi. Sonra bu cam Məkkədə tapıldıqda onun sahibləri: "Biz bu camı Təmim və Adiydən satın almışıq"– dedilər. Bu vaxt vəfat etmiş səhmlinin qohumlarından iki nəfər qalxıb and içərək dedilər: "Sözsüz ki, bizim şahidliyimiz onların şahidliyindən daha doğrudur və bu cam əvvəlki sahiblərinə – (Bənu Səhm qəbiləsindən olan kişinin varislərinə) çatmalıdır!" Bundan sonra onlar barəsində bu ayə nazil oldu: **"Ey iman gətirənlər! Sizlərdən bir kimsəyə ölüm gəldiyi zaman, vəsiyyət vaxtı içinizdən iki ədalətli kişi, bir yerə səfərə çıxdığınız zaman başınıza ölüm müsibəti gəldikdə isə özünüzdən olmayan iki kişi aranızda şahidlik etsin. Əgər** ***özünüzdən olmayan şahidlərə*** **şübhə etsəniz, namazdan sonra hər ikisini saxlayın və qoy onlar: "Biz bu** ***andımızı*** **lap yaxın qohumlara belə heç bir qiymətə satmarıq və Allahın şahidliyini gizlətmərik. Əks halda biz, şübhəsiz ki, günahkarlardan olarıq"–** ***deyə*** **and içsinlər. Əgər hər ikisinin günah iş tutduqları aşkar edilsə, o zaman onların yerini haqsızlığa məruz qalanlardan** ***ölən şəxsə*** **daha yaxın olan iki kişi tutar və onlar: "Əlbəttə, bizim şahidliyimiz o iki nəfərin şahidliyindən daha doğrudur və biz həddi aşmadıq. Əks halda biz, şübhəsiz ki, zalımlardan olarıq"–** ***deyə*** **and içərlər. Bu, onların olduğu kimi şahidlik etmələri və ya andlarının sonradan** ***varislər tərəfindən başqa*** **andlarla rədd edilməsindən qorxmaları üçün daha münasibdir. Allahdan qorxun və qulaq asın! Allah günahkar tayfanı doğru yola yönəltməz."**[1] (əl-Buxari, 2780)

---

[1] "əl-Maidə" surəsi, 106-108.

# ٥٦ – كِتَابُ الجِهَادِ

# 56 – Cihad kitabı

## ١– باب: فَضْلُ الْجِهَادِ وَالسِّيَر

## 1-ci fəsil. Cihadın[1] fəziləti

١٢٠٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ دُلَّنِي عَلَى عَمَلٍ يَعْدِلُ الْجِهَادَ. قَالَ: «لاَ أَجِدُهُ – قَالَ – هَلْ تَسْتَطِيعُ إِذَا خَرَجَ الْمُجَاهِدُ أَنْ تَدْخُلَ مَسْجِدَكَ فَتَقُومَ وَلاَ تَفْتُرَ وَتَصُومَ وَلاَ تُفْطِرَ». قَالَ وَمَنْ يَسْتَطِيعُ ذَلِكَ. [رواه البخاري: ٢٧٨٥]

**1202.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "(Bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Mənə cihada bərabər[2] olan bir əməl göstər." Peyğəmbər ﷺ buyurdu: "Belə bir əməl bilmirəm. (Bir qədər susduqdan sonra) soruşdu: "Mücahid döyüşə yollandıqdan sonra sən öz məscidinə gedib dayanmadan namaz qıla bilərsənmi və iftar etmədən oruc tuta bilərsənmi?" (Həmin adam) dedi: "Bunu kim bacara bilər ki?!" (əl-Buxari, 2785)

## ٢– باب: أَفْضَلُ النَّاسِ مُؤْمِنٌ يُجَاهِدُ بِنَفْسِهِ وَمَالِهِ فِي سَبِيلِ اللَّهِ

## 2-ci fəsil. İnsanların ən üstünü Allah yolunda malı və canı ilə cihad edən mömindir

١٢٠٣ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ قَالَ: قِيلَ يَا رَسُولَ اللَّهِ، أَيُّ النَّاسِ أَفْضَلُ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «مُؤْمِنٌ يُجَاهِدُ فِي سَبِيلِ اللَّهِ بِنَفْسِهِ وَمَالِهِ». قَالُوا ثُمَّ مَنْ قَالَ: «مُؤْمِنٌ فِي شِعْبٍ مِنَ الشِّعَابِ يَتَّقِي اللَّهَ، وَيَدَعُ النَّاسَ مِنْ شَرِّهِ». [رواه البخاري: ٢٧٨٦]

**1203.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "(Bir dəfə Peyğəmbərdən ﷺ) soruşdular: "Ya Rəsulullah, insanların ən üstünü kimdir?" Peyğəmbər ﷺ dedi: "Allah yolunda malı və canı ilə cihad edən mömindir." Soruşdular: "Sonra hansıdır?" Dedi: "Dağ dərəsinə[3] çəkilib Allahdan qorxan və insanlara pislik etməkdən çəkinən mömindir." (əl-Buxari, 2786)

---

[1] Allah yolunda müqəddəs müharibə; Uca Allahın adını uca tutmaq məqsədilə göstərilən istənilən səy. Cihadın bir neçə forması var. Müsəlman dövlətinin təhlükəsizliyinə qəsd edən və İslamın yayılmasına maneə yaradan kafirlərlə mübarizə hərbi yolla aparılır. Özlərini müsəlman kimi göstərən münafiqlərlə dini moizələr və onlara haqqın çatdırılması vasitəsilə aparılır. İnsanın şeytanla, həmçinin öz nəfsi ilə apardığı cihad da mövcuddur.

[2] Yəni savabı cihadın savabına bərabər bir əməl.

[3] Nəvəvi demişdir: "Bu, ibrətamiz bir məsəldir. Belə ki, möminin təkliyə çəkilib (Allaha ibadət etməklə məşğul olub heç nəyə və heç kəsə qarışmamağı), "dağ dərəsində" – insanlardan uzaq düşmüş bir adamın halına bənzəyir." İbn Həcər demişdir: "Bu hədis təkliyə çəkilməyin fəzilətinə dəlalət edir. Çünki belə olduqda adam qeybətdən, boşboğazlıqdan və başqa bu kimi bihudə işlərdən uzaq olur. Lakin qeyd etmək lazımdır ki, – müsəlmanlar arasına fitnə düşdüyü vaxt istisna olmaqla – heç bir zamanda və heç bir halda camaatdan ayrılmaq olmaz." Peyğəmbər ﷺ demişdir: "...Allahın Əli (haqq yolda olan) camaatın üzərindədir!" (Səhihul-Camius-Səğir, 2729-cu hədis). Digər rəvayətdə demişdir: "Kənddə və ya çöl-biyabanda olan üç nəfər camaat şəklində namaz qılmasalar, şeytan onlara hakim olar. Belə olmasın deyə camaat olun! Əlbəttə ki, canavar sürüdən ayrı düşmüş qoyunu (tez) yeyər." (Hədisi Əhməd, Əbu Davud və ən-Nəsai rəvayət etmişdir.)

١٢٠٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «مَثَلُ الْمُجَاهِدِ فِى سَبِيلِ اللَّهِ – وَاللَّهُ أَعْلَمُ بِمَنْ يُجَاهِدُ فِى سَبِيلِهِ – كَمَثَلِ الصَّائِمِ الْقَائِمِ، وَتَوَكَّلَ اللَّهُ لِلْمُجَاهِدِ فِى سَبِيلِهِ بِأَنْ يَتَوَفَّاهُ أَنْ يُدْخِلَهُ الْجَنَّةَ، أَوْ يَرْجِعَهُ سَالِمًا مَعَ أَجْرٍ أَوْ غَنِيمَةٍ». [رواه البخاري: ٢٧٨٧]

**1204.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Allah yolunda vuruşan mücahidin misalı, – kimin Allah yolunda (səmimiyyətlə) vuruşduğunu isə Allah daha yaxşı bilir, – ara vermədən oruc tutan və namaz qılan kimsənin misalına bənzəyir. Allah, Onun yolunda cihad edən kimsəyə zəmanət vermişdir ki, onu, ya canını alıb Cənnətə daxil edəcək, ya da sağ-salamat, savab və ya qənimətlə geri qaytaracaq." (əl-Buxari, 2787)

## 3-cü fəsil. Allah yolunda cihad edən kimsələrin dərəcələri

## ٣– باب: دَرَجَاتُ الْمُجَاهِدِينَ فِى سَبِيلِ اللَّهِ

١٢٠٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ آمَنَ بِاللَّهِ وَبِرَسُولِهِ وَأَقَامَ الصَّلَاةَ وَصَامَ رَمَضَانَ، كَانَ حَقًّا عَلَى اللَّهِ أَنْ يُدْخِلَهُ الْجَنَّةَ جَاهَدَ فِى سَبِيلِ اللَّهِ، أَوْ جَلَسَ فِى أَرْضِهِ الَّتِى وُلِدَ فِيهَا». فَقَالُوا يَا رَسُولَ اللَّهِ أَفَلَا نُبَشِّرُ النَّاسَ. قَالَ: «إِنَّ فِى الْجَنَّةِ مِائَةَ دَرَجَةٍ أَعَدَّهَا اللَّهُ لِلْمُجَاهِدِينَ فِى سَبِيلِ اللَّهِ، مَا بَيْنَ الدَّرَجَتَيْنِ كَمَا بَيْنَ السَّمَاءِ وَالأَرْضِ، فَإِذَا سَأَلْتُمُ اللَّهَ فَاسْأَلُوهُ الْفِرْدَوْسَ، فَإِنَّهُ أَوْسَطُ الْجَنَّةِ وَأَعْلَى الْجَنَّةِ، فَوْقَهُ عَرْشُ الرَّحْمَنِ، وَمِنْهُ تَفَجَّرُ أَنْهَارُ الْجَنَّةِ». [رواه البخاري: ٢٧٩٠]

**1205.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Allaha və Onun elçisinə iman gətirir, namaz qılır və ramazan orucunu tutursa, (bundan sonra) istər Allah yolunda cihad etsin, istərsə də doğulduğu diyarda qalsın, Allah onu Cənnətə daxil etməyi Özünə vacib bilmişdir." (Əshabələr) dedilər: "Ya Rəsulullah, insanları müjdələməyəkmi?" Peyğəmbər ﷺ dedi: "Cənnətdə Allahın, Onun yolunda cihad edənlər üçün hazırladığı yüz mərtəbə vardır. (Bu mərtəbələrdən) hər iki mərtəbə arasındakı məsafə yerlə göy arasında olan məsafəyə bərabərdir. Allahdan (nə isə) dilədiyiniz zaman Firdovs cənnətini diləyin! Çünki Firdovs, Cənnətin tam ortası və ən yüksək mərtəbəsidir. Onun üstündə isə ər-Rəhmanın Ərşi[1] yerləşir. Cənnət çayları oradan qaynayıb axır." (əl-Buxari, 2790)

## 4-cü fəsil. Allah yolunda səhər və axşam (döyüşə) getmək; birinizin Cənnətdəki ox boyda yeri (dünya və onun içindəkilərdən xeyirlidir)

## ٤– باب: الْغَدْوَةُ وَالرَّوْحَةُ فِى سَبِيلِ اللَّهِ، وَقَابُ قَوْسِ أَحَدِكُمْ مِنَ الْجَنَّةِ

١٢٠٦ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لَغَدْوَةٌ فِى سَبِيلِ اللَّهِ أَوْ رَوْحَةٌ خَيْرٌ مِنَ الدُّنْيَا وَمَا فِيهَا». [رواه البخاري: ٢٧٩٢]

[1] "əl-Bəqərə" surəsi, 255-ci ayənin təfsirinə bax.

**1206.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah yolunda səhər və ya axşam (döyüşə) getmək dünya və onun içindəkilərdən xeyirlidir." (əl-Buxari, 2792)

١٢٠٧ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لَقَابُ قَوْسٍ فِى الْجَنَّةِ خَيْرٌ مِمَّا تَطْلُعُ عَلَيْهِ الشَّمْسُ وَتَغْرُبُ». وَقَالَ: «لَغَدْوَةٌ أَوْ رَوْحَةٌ فِى سَبِيلِ اللَّهِ خَيْرٌ مِمَّا تَطْلُعُ عَلَيْهِ الشَّمْسُ وَتَغْرُبُ». [رواه البخاري: ٢٧٩٣]

**1207.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Birinizin Cənnətdəki ox boyda yeri, üstündə günəş doğan və batan hər bir şeydən daha xeyirlidir." Həmçinin demişdir: "Allah yolunda səhər və ya axşam (döyüşə) getmək üstündə günəş doğan və batan hər bir şeydən daha xeyirlidir." (əl-Buxari, 2793)

## 5-ci fəsil. Hurilər[1] və onların xüsusiyyətləri

## ٥– باب: الْحُورُ الْعِينُ وَصِفَتُهُنَّ

١٢٠٨ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ عَنِ النَّبِىِّ ﷺ: «لَرَوْحَةٌ فِى سَبِيلِ اللَّهِ أَوْ غَدْوَةٌ خَيْرٌ مِنَ الدُّنْيَا وَمَا فِيهَا، وَلَقَابُ قَوْسِ أَحَدِكُمْ مِنَ الْجَنَّةِ أَوْ مَوْضِعُ قِيد – يَعْنِى سَوْطَهُ – خَيْرٌ مِنَ الدُّنْيَا وَمَا فِيهَا، وَلَوْ أَنَّ امْرَأَةً مِنْ أَهْلِ الْجَنَّةِ اطَّلَعَتْ إِلَى أَهْلِ الأَرْضِ لأَضَاءَتْ مَا بَيْنَهُمَا وَلَمَلأَتْهُ رِيحًا، وَلَنَصِيفُهَا عَلَى رَأْسِهَا خَيْرٌ مِنَ الدُّنْيَا وَمَا فِيهَا». [رواه البخاري: ٢٧٩٦]

**1208.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah yolunda səhər və ya axşam (döyüşə) getmək dünya və onun içindəkilərdən xeyirlidir. Birinizin Cənnətdəki ox boyda yeri (və ya qamçısını qoyduğu yer), dünya və onun içindəkilərdən xeyirlidir. Əgər Cənnət qadınlarından biri yer sakinlərinə görünsəydi, göylə yer arasında olan hər tərəfi işıqlandırar və (onun gözəl) iyi hər yanı bürüyərdi. Onun baş örtüyü isə dünya və onun içindəkilərdən xeyirlidir." (əl-Buxari, 2796)

## 6-cı fəsil. Allah yolunda əziyyət çəkən (adamın mükafatı)

## ٦– باب: مَنْ يُنْكَبُ فِى سَبِيلِ اللَّهِ

١٢٠٩ – عَنْ أَنَسٍ ﷺ قَالَ بَعَثَ النَّبِىُّ ﷺ أَقْوَامًا مِنْ بَنِى سُلَيْمٍ إِلَى بَنِى عَامِرٍ فِى سَبْعِينَ، فَلَمَّا قَدِمُوا، قَالَ لَهُمْ خَالِى أَتَقَدَّمُكُمْ، فَإِنْ أَمَّنُونِى حَتَّى أُبَلِّغَهُمْ عَنْ رَسُولِ اللَّهِ ﷺ وَإِلاَّ كُنْتُمْ مِنِّى قَرِيبًا. فَتَقَدَّمَ ، فَأَمَّنُوهُ، فَبَيْنَمَا يُحَدِّثُهُمْ عَنِ النَّبِىِّ ﷺ إِذْ أَوْمَئُوا إِلَى رَجُلٍ مِنْهُمْ، فَطَعَنَهُ فَأَنْفَذَهُ فَقَالَ اللَّهُ أَكْبَرُ، فُزْتُ وَرَبِّ الْكَعْبَةِ. ثُمَّ مَالُوا عَلَى بَقِيَّةِ أَصْحَابِهِ فَقَتَلُوهُمْ، إِلاَّ رَجُلاً أَعْرَجَ صَعِدَ الْجَبَلَ. فَأَخْبَرَ جِبْرِيلُ ﷺ النَّبِىَّ ﷺ أَنَّهُمْ قَدْ لَقُوا رَبَّهُمْ، فَرَضِىَ عَنْهُمْ وَأَرْضَاهُمْ، فَكُنَّا نَقْرَأُ أَنْ بَلِّغُوا قَوْمَنَا أَنْ قَدْ لَقِينَا رَبَّنَا فَرَضِىَ عَنَّا وَأَرْضَانَا. ثُمَّ نُسِخَ بَعْدُ، فَدَعَا عَلَيْهِمْ أَرْبَعِينَ صَبَاحًا، عَلَى رِعْلٍ وَذَكْوَانَ وَبَنِى لِحْيَانَ وَبَنِى عُصَيَّةَ الَّذِينَ عَصَوُا اللَّهَ وَرَسُولَهُ ﷺ. [رواه البخاري: ٢٨٠١]

[1] Adəmin ﷺ nəslinə aidiyyəti olmayan, qeyri-adi gözəlliyə malik və xüsusilə seçilən iri qara gözlü Cənnət qadınları.

**1209.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Peyğəmbər ﷺ Bənu-Suleym qəbiləsindən yetmiş nəfəri Bənu-Amir qəbiləsinə göndərdi. Onlar (mənzil başına) yetişdikdə dayım dedi: "Mən gedirəm qabağa! Əgər onlar mənə Peyğəmbərin ﷺ dediyini onlara arxayın çatdırmaq imkanı versələr, (çox yaxşı). Əks halda isə mənə yaxın bir yerdə olarsınız." Sonra dayım qabaqda getdi və (müşriklər) onun təhlükəsizliyinə zəmanət verdilər. Dayım Peyğəmbərin ﷺ dediyini (müşriklərə) söyləyərkən onlar öz aralarından birisinə işarə etdilər və həmin adam (əlindəki nizəni) dayımın bir böyründən soxub digər böyründən çıxartdı. Onda dayım: "Allahu Əkbər! Kəbənin Rəbbinə and olsun ki, mən uğur qazandım!"– dedi (və qardaşlarının yanına qayıtdı). Bundan sonra (müşriklər) hücum edib yerdə qalan əshabələri də öldürdülər. Yalnız dağa qalxmış bir axsaq əshabə onlardan canını qurtara bildi. Bu vaxt Cəbrail Peyğəmbərə ﷺ xəbər verdi ki, artıq onlar Rəbbinə qovuşmuşlar; Rəbbi onlardan razı qaldı, onlar da Ondan razı qaldılar. Biz (Qurandan): "Qövmümüzə çatdırın ki, artıq biz Rəbbimizə qovuşduq. Rəbbimiz bizdən, biz də Ondan razıyıq" ayəsini oxuyurduq. Sonra bu ayənin tilavəti ləğv edildi.

Bundan sonra Peyğəmbər ﷺ qırx gün hər səhər o müşriklərə – Allaha və Onun elçisinə asi olmuş Ril, Zəkvan, Bəni Lihyan və Bəni Useyyə qəbilələrinə bəddua etdi. (əl-Buxari, 2801)

١٢١٠ – عَنْ جُنْدَبِ بْنِ سُفْيَانَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ فِى بَعْضِ الْمَشَاهِدِ وَقَدْ دَمِيَتْ إِصْبَعُهُ، فَقَالَ: «هَلْ أَنْتِ إِلاَّ إِصْبَعٌ دَمِيتِ، وَفِى سَبِيلِ اللَّهِ مَا لَقِيتِ». [رواه البخاري: ٢٨٠٢]

**1210.** Cundəb ibn Süfyan ﷺ rəvayət edir ki, döyüşlərin birində Peyğəmbər ﷺ barmağından yaralandığı zaman dedi: "Sən qanayan bir barmaq deyilsənmi? Sənə üz vermiş bu müsibət Allah yolundadır!" (əl-Buxari, 2802)

## ٧– باب: مَنْ يُجْرَحُ فِى سَبِيلِ اللَّهِ عَزَّ وَجَلَّ

## 7-ci fəsil. Qüdrətli və əzəmətli Allahın yolunda yaralanan kimsə haqqında

١٢١١ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «وَالَّذِى نَفْسِى بِيَدِهِ لاَ يُكْلَمُ أَحَدٌ فِى سَبِيلِ اللَّهِ – وَاللَّهُ أَعْلَمُ بِمَنْ يُكْلَمُ فِى سَبِيلِهِ – إِلاَّ جَاءَ يَوْمَ الْقِيَامَةِ وَاللَّوْنُ لَوْنُ الدَّمِ وَالرِّيحُ رِيحُ الْمِسْكِ». [رواه البخاري: ٢٨٠٣]

**1211.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Canım Əlində olan Allaha and olsun ki, kim Allah yolunda yaralansa, – kimin Allah yolunda yaralandığını isə Allah daha yaxşı bilir, – Qiyamət günü (məhşərə) gəldikdə (yarasının qanı) qan rəngi, qoxusu isə müşk qoxusu olacaqdır.[1]" (əl-Buxari, 2803)

[1] 176-cı hədisə bax.

## ٨– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿مِّنَ ٱلْمُؤْمِنِينَ رِجَالٌ صَدَقُواْ مَا عَـٰهَدُواْ ٱللَّهَ عَلَيْهِ فَمِنْهُم مَّن قَضَىٰ نَحْبَهُۥ وَمِنْهُم مَّن يَنتَظِرُ وَمَا بَدَّلُواْ تَبْدِيلًا﴾

## 8-ci fəsil. Uca Allahın: "Möminlərin içərisində Allaha etdikləri əhdə sadiq qalan kişilər vardır. Onlardan kimisi əhdini yerinə yetirib şəhid olmuş, kimisi də *şəhid olmasını* gözləyir. Onlar *əhdlərini* əsla dəyişdirməyiblər."[1] sözü

١٢١٢ – (أ)– عَنْ أَنَسٍ ﷺ قَالَ غَابَ عَمِّى أَنَسُ بْنُ النَّضْرِ عَنْ قِتَالِ بَدْرٍ فَقَالَ يَا رَسُولَ اللَّهِ، غِبْتُ عَنْ أَوَّلِ قِتَالٍ قَاتَلْتَ الْمُشْرِكِينَ، لَئِنِ اللَّهُ أَشْهَدَنِى قِتَالَ الْمُشْرِكِينَ لَيَرَيَنَّ اللَّهُ مَا أَصْنَعُ، فَلَمَّا كَانَ يَوْمُ أُحُدٍ وَانْكَشَفَ الْمُسْلِمُونَ قَالَ: «اللَّهُمَّ إِنِّى أَعْتَذِرُ إِلَيْكَ مِمَّا صَنَعَ هَؤُلاَءِ – يَعْنِى أَصْحَابَهُ – وَأَبْرَأُ إِلَيْكَ مِمَّا صَنَعَ هَؤُلاَءِ» – يَعْنِى الْمُشْرِكِينَ – ثُمَّ تَقَدَّمَ، فَاسْتَقْبَلَهُ سَعْدُ بْنُ مُعَاذٍ، فَقَالَ يَا سَعْدُ بْنَ مُعَاذٍ، الْجَنَّةَ، وَرَبِّ النَّضْرِ إِنِّى أَجِدُ رِيحَهَا مِنْ دُونِ أُحُدٍ. قَالَ سَعْدٌ فَمَا اسْتَطَعْتُ يَا رَسُولَ اللَّهِ مَا صَنَعَ. قَالَ أَنَسٌ فَوَجَدْنَا بِهِ بِضْعًا وَثَمَانِينَ ضَرْبَةً بِالسَّيْفِ أَوْ طَعْنَةً بِرُمْحٍ أَوْ رَمْيَةً بِسَهْمٍ، وَوَجَدْنَاهُ قَدْ قُتِلَ وَقَدْ مَثَّلَ بِهِ الْمُشْرِكُونَ، فَمَا عَرَفَهُ أَحَدٌ إِلاَّ أُخْتُهُ بِبَنَانِهِ. قَالَ أَنَسٌ كُنَّا نَرَى أَوْ نَظُنُّ أَنَّ هَذِهِ الآيَةَ نَزَلَتْ فِيهِ وَفِى أَشْبَاهِهِ: ﴿مِّنَ ٱلْمُؤْمِنِينَ رِجَالٌ صَدَقُواْ مَا عَـٰهَدُواْ ٱللَّهَ عَلَيْهِ﴾ إِلَى آخِرِ الآيَةِ. [رواه البخاري: ٢٨٠٥–٢٨٠٦]

**1212.** (a) – Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Əmim Ənəs ibn Nədr Bədr döyüşündə iştirak etməmişdi. (Ona görə də o, Peyğəmbərə ﷺ dedi): "Ya Rəsulullah! Mən sənin müşriklərə qarşı apardığın ilk döyüşdə iştirak etməmişəm. Allah (nə vaxtsa) onlara qarşı döyüşməyi mənə nəsib edərsə, mənim necə vuruşacağımı görəcək." Uhud döyüşündə müsəlmanlar məğlub olarkən əmim dedi: "Allahım, mən bunların – yəni əshabələrin – etdikləri (xətalara) görə Səndən üzr diləyirəm və onların – yəni müşriklərin – etdikləri (günahlardan) Sənə sığınıram!" Sonra o, döyüşə atıldı. (İrəlidə o,) Səd ibn Muazla rastlaşdı və dedi: "Ey Səd ibn Muaz! Cənnətə və Nədrin Rəbbinə (qovuşmaq istəyirəm). Mən Uhud tərəfdən (gələn) Cənnətin iyini duyuram." (Döyüşdən sonra) Səd dedi: "Ya Rəsulullah! Onun elədiyini (mən) edə bilmədim."

Ənəs demişdir: "Biz onu ölənlərin arasında tapdıq. Onun üzərində səksəndən çox qılınc, nizə və ox yarası var idi. Müşriklər onun cəsədini elə tanınmaz hala salmışdılar ki, bacısından başqa heç kəs onu tanımadı. Bacısı onu barmaqlarının ucundan tanıdı. Biz yəqin bilirdik ki, bu ayə onun və onun kimilərinin barəsində nazil olmuşdur: "**Möminlərin içərisində Allaha etdikləri əhdə sadiq qalan kişilər vardır. Onlardan kimisi əhdini yerinə yetirib şəhid olmuş, kimisi də *şəhid olmasını* gözləyir. Onlar *əhdlərini* əsla dəyişdirməyiblər.**"(əl-Buxari, 2805-2806)

١٢١٢ – (ب)– عَنْ أَنَسٍ ﷺ قَالَ: إِنَّ أُخْتَهُ وَهِىَ تُسَمَّى الرُّبَيِّعَ كَسَرَتْ ثَنِيَّةَ امْرَأَةٍ فَأَمَرَ رَسُولُ اللَّهِ ﷺ بِالْقِصَاصِ، فَقَالَ أَنَسٌ يَا رَسُولَ اللَّهِ، وَالَّذِى بَعَثَكَ بِالْحَقِّ لاَ تُكْسَرُ ثَنِيَّتُهَا. فَرَضُوا بِالأَرْشِ وَتَرَكُوا الْقِصَاصَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّ مِنْ عِبَادِ اللَّهِ مَنْ لَوْ أَقْسَمَ عَلَى اللَّهِ لأَبَرَّهُ». [رواه البخاري: ٢٨٠٥–٢٨٠٦]

---

[1] "əl-Əhzab" surəsi, 23.

**1212.** (b) – Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) Ənəs ibn Nədrin bacısı Rubeyyi ﷺ (başqa) bir qadının ön dişlərini sındırdı və Peyğəmbər ﷺ ondan qisas almağı əmr etdi. (Bunu eşidən) Ənəs ibn Nədr dedi: "Ya Rəsulullah! Səni haqq ilə göndərən Allaha and olsun ki, onun ön dişləri qırılmayacaq!" Sonra (qadının qohumları) qanbahası almağa razılıq verib qisas almaqdan vaz keçdilər. Onda Peyğəmbər ﷺ buyurdu: "Allahın qulları arasında elələri də vardır ki, onlar Allaha and içsələr, Allah onların andını gerçəyə çevirər." (əl-Buxari, 2805-2806)

**١٢١٣** – عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ﷺ قَالَ: نَسَخْتُ الصُّحُفَ فِي الْمَصَاحِفِ، فَفَقَدْتُ آيَةً مِنْ سُورَةِ الأَحْزَابِ، كُنْتُ أَسْمَعُ رَسُولَ اللَّهِ ﷺ يَقْرَأُ بِهَا، فَلَمْ أَجِدْهَا إِلاَّ مَعَ خُزَيْمَةَ بْنِ ثَابِتٍ الأَنْصَارِيِّ الَّذِي جَعَلَ رَسُولُ اللَّهِ ﷺ شَهَادَتَهُ شَهَادَةَ رَجُلَيْنِ، وَهُوَ قَوْلُهُ: ﴿مِّنَ ٱلْمُؤْمِنِينَ رِجَالٌ صَدَقُوا۟ مَا عَٰهَدُوا۟ ٱللَّهَ عَلَيْهِ﴾. [رواه البخاري: ٢٨٠٧]

**1213.** Rəvayət edilir ki, Zeyd ibn Sabit ﷺ demişdir: "Mən Quranı səhifələrə köçürərkən Peyğəmbərin ﷺ tez-tez oxuduğu "əl-Əhzab" surəsinin bir ayəsini tapa bilmirdim. Mən onu ancaq Xuzeymə ibn Sabit əl-Ənsaridə tapdım. Bu (həmin o əshabə idi ki,) Peyğəmbər ﷺ onun şahidliyini iki kişinin şahidliyinə bərabər tutmuşdu.[1] (Onun bildiyi isə Allahın) bu ayəsidir: "**Möminlərin içərisində Allaha etdikləri əhdə sadiq qalan kişilər vardır. Onlardan kimisi əhdini yerinə yetirib şəhid olmuş, kimisi də *şəhid olmasını* gözləyir. Onlar *əhdlərini* əsla dəyişdirməyiblər.**" (əl-Buxari, 2807)

## 9-cu fəsil. Döyüşdən əvvəl yaxşı iş görmək

## ٩– باب: عَمَلٌ صَالِحٌ قَبْلَ الْقِتَالِ

**١٢١٤** – عَنْ الْبَرَاءِ ﷺ يَقُولُ أَتَى النَّبِيَّ ﷺ رَجُلٌ مُقَنَّعٌ بِالْحَدِيدِ فَقَالَ يَا رَسُولَ اللَّهِ أُقَاتِلُ وَأُسْلِمُ. قَالَ: «أَسْلِمْ ثُمَّ قَاتِلْ». فَأَسْلَمَ ثُمَّ قَاتَلَ، فَقُتِلَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «عَمِلَ قَلِيلاً وَأُجِرَ كَثِيرًا». [رواه البخاري: ٢٨٠٨]

**1214.** Bəra ﷺ rəvayət edir ki, (döyüşlərin birində) başında dəmir dəbilqə olan bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, (bəlkə əvvəlcə) döyüşüm, sonra İslamı qəbul edim?" Peyğəmbər ﷺ buyurdu: "İslamı qəbul et, sonra döyüş!" O da İslamı qəbul edib sönra döyüşdü və şəhid oldu. Onda Peyğəmbər ﷺ buyurdu: "O, az iş gördü, lakin çox savab qazandı." (əl-Buxari, 2808)

---

[1] Əmmarə ibn Xuzeymənin ﷺ əmisi rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ bir bədəvidən at aldı, sonra da ondan dalınca gəlməyi tələb etdi ki, ona atın pulunu ödəsin. Həmin vaxt Peyğəmbər ﷺ tez-tez, bədəvi isə yavaş-yavaş gedirdi. Bu əsnada bəzi adamlar bədəvinin qabağını kəsib onunla qiymət danışmağa başladılar. Onlar bilmirdilər ki, Peyğəmbər ﷺ artıq o atı almışdır. Bu vaxt həmin bədəvi Peyğəmbəri ﷺ çağırıb dedi: "Atı alırsan al, almırsansa, onu başqasına satıram." Peyğəmbər ﷺ bunu eşidəndə (təəccüblə) dedi: "Məgər mən bu atı səndən almamışam?!" Bədəvi: "Yox, vallahi, mən onu sənə satmamışam!"- dedi. Peyğəmbər ﷺ buyurdu: "Xeyr, mən onu səndən almışam." Onda bədəvi: "Şahid gətir!"- dedi. Bu vaxt Xuzeymə ibn Sabit ﷺ dedi: "Mən şahidlik edirəm ki, sən o atı satmısan." Peyğəmbər ﷺ Xuzeyməyə ﷺ yaxınlaşıb soruşdu ki: "Sən nəyə şahidlik edirsən?" Xuzeymə ﷺ dedi: "Sənin təsdiqinə, ya Rəsulullah!" Onda Peyğəmbər ﷺ onun şahidliyini iki kişinin şahidliyinə bərabər tutdu." (Səhih Sünən Əbu Davud, 8/107)

## 10-cu fəsil. Naməlum istiqamətdən atılmış oxla öldürülmüş kimsə haqqında

## ١٠– باب: مَنْ أَتَاهُ سَهْمٌ غَرْبٌ فَقَتَلَهُ

١٢١٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّ أُمَّ الرُّبَيِّعِ بِنْتَ الْبَرَاءِ وَهِىَ أُمُّ حَارِثَةَ بْنِ سُرَاقَةَ أَتَتِ النَّبِىَّ ﷺ فَقَالَتْ يَا نَبِىَّ اللَّهِ، أَلاَ تُحَدِّثُنِى عَنْ حَارِثَةَ وَكَانَ قُتِلَ يَوْمَ بَدْرٍ أَصَابَهُ سَهْمٌ غَرْبٌ، فَإِنْ كَانَ فِى الْجَنَّةِ، صَبَرْتُ، وَإِنْ كَانَ غَيْرَ ذَلِكَ اجْتَهَدْتُ عَلَيْهِ فِى الْبُكَاءِ. قَالَ: «يَا أُمَّ حَارِثَةَ، إِنَّهَا جِنَانٌ فِى الْجَنَّةِ، وَإِنَّ ابْنَكِ أَصَابَ الْفِرْدَوْسَ الأَعْلَى». [رواه البخاري: ٢٨٠٩]

**1215.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, (bir dəfə) Harisə ibn Suraqənin anası Ummu Rubeyyi bint əl-Bəra Peyğəmbərin ﷺ yanına gəlib dedi: Ey Allahın peyğəmbəri, sən mənə Harisə barəsində xəbər verməyəcəksənmi? – Harisə Bədr döyüşündə naməlum istiqamətdən atılmış bir oxla vurulub öldürülmüşdü. – Əgər o, Cənnətdədirsə, səbir edəcəyəm. Yox əgər ora düşməyibsə, onun üçün acı-acı ağlayacağam." Peyğəmbər ﷺ buyurdu: "Ey Ummu Harisə! Həqiqətən, Cənnətdə bağlar vardır və həqiqətən, sənin oğlun ən yüksək Firdovs cənnətinə düşmüşdür." (əl-Buxari, 2809)

## 11-ci fəsil. Allahın Sözünün (hər şeydən) uca olması üçün vuruşan kimsə

## ١١– باب: مَنْ قَاتَلَ لِتَكُونَ كَلِمَةُ اللَّهِ هِىَ الْعُلْيَا

١٢١٦ – عَنْ أَبِى مُوسَى ﷺ قَالَ: جَاءَ رَجُلٌ إِلَى النَّبِىِّ ﷺ فَقَالَ الرَّجُلُ يُقَاتِلُ لِلْمَغْنَمِ، وَالرَّجُلُ يُقَاتِلُ لِلذِّكْرِ، وَالرَّجُلُ يُقَاتِلُ لِيُرَى مَكَانُهُ، فَمَنْ فِى سَبِيلِ اللَّهِ قَالَ: «مَنْ قَاتَلَ لِتَكُونَ كَلِمَةُ اللَّهِ هِىَ الْعُلْيَا فَهُوَ فِى سَبِيلِ اللَّهِ». [رواه البخاري: ٢٨١٠]

**1216.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "(Bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "(İnsanlardan) kimisi qənimət əldə etmək üçün, kimisi adsan qazanmaq üçün, kimisi də özünü göstərmək üçün vuruşur. Bunlardan hansı biri Allah yolundadır?" Peyğəmbər ﷺ buyurdu: "Kim Allahın Sözü (hər şeydən) uca olsun deyə vuruşursa, o, Allah yolundadır." (əl-Buxari, 2810)

## 12-ci fəsil. Döyüşdən və (döyüş əsnasında) toza bulaşdıqdan sonra qüsl etmək

## ١٢– باب: الْغَسْلُ بَعْدَ الْحَرْبِ وَالْغُبَارِ

١٢١٧ – عَنْ عَائِشَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ لَمَّا رَجَعَ يَوْمَ الْخَنْدَقِ وَوَضَعَ السِّلاَحَ وَاغْتَسَلَ، فَأَتَاهُ جِبْرِيلُ وَقَدْ عَصَبَ رَأْسَهُ الْغُبَارُ فَقَالَ وَضَعْتَ السِّلاَحَ، فَوَاللَّهِ مَا وَضَعْتُهُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «فَأَيْنَ؟». قَالَ هَا هُنَا. وَأَوْمَأَ إِلَى بَنِى قُرَيْظَةَ. قَالَتْ فَخَرَجَ إِلَيْهِمْ رَسُولُ اللَّهِ ﷺ. [رواه البخاري: ٢٨١٣]

**1217.** Aişə ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ Xəndək döyüşündən qayıtdıqdan sonra silahını yerə qoydu və qüsl etdi. Peyğəmbərin ﷺ başı hələ toz-torpaq içində ikən Cəbrail onun yanına gəlib dedi: "Sən silahı yerə qoymusan?! Vallahi, mən hələ silahı qoymamışam." Peyğəmbər ﷺ: "(Səfərimiz) haradır?"- deyə soruşdu. Cəbrail: "Bax oraya!"– deyib Bəni Qureyzə[1] qəbiləsinə tərəf işarə etdi. Peyğəmbər ﷺ onların üstünə getdi. (əl-Buxari, 2813)

## ١٣– باب: الْكَافِرُ يَقْتُلُ الْمُسْلِمَ ثُمَّ يُسْلِمُ فَيُسَدِّدُ بَعْدُ وَيُقْتَلُ

## 13-cü fəsil. Bir kafirin (döyüşdə) bir müsəlmanı öldürməsi, sonra müsəlman olub əməllərini islah etməsi və (döyüşlərin birində) öldürülməsi

١٢١٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «يَضْحَكُ اللَّهُ إِلَى رَجُلَيْنِ يَقْتُلُ أَحَدُهُمَا الآخَرَ يَدْخُلاَنِ الْجَنَّةَ، يُقَاتِلُ هَذَا فِى سَبِيلِ اللَّهِ فَيُقْتَلُ، ثُمَّ يَتُوبُ اللَّهُ عَلَى الْقَاتِلِ فَيُسْتَشْهَدُ». [رواه البخاري: ٢٨٢٦]

**1218.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah iki nəfərə gülür: bunlardan biri digərini öldürür, (nəticədə isə) hər ikisi Cənnətə daxil olur. Belə ki, bu[2], Allah yolunda vuruşub ölür; sonra Allah (onun) qatilinin tövbəsini qəbul edir və o da (Allah yolunda vuruşub) şəhid olur." (əl-Buxari, 2826)

١٢١٩ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: أَتَيْتُ رَسُولَ اللَّهِ ﷺ وَهُوَ بِخَيْبَرَ بَعْدَ مَا افْتَتَحُوهَا، فَقُلْتُ يَا رَسُولَ اللَّهِ أَسْهِمْ لِى. فَقَالَ بَعْضُ بَنِى سَعِيدِ بْنِ الْعَاصِ لاَ تُسْهِمْ لَهُ يَا رَسُولَ اللَّهِ. فَقَالَ أَبُو هُرَيْرَةَ هَذَا قَاتِلُ ابْنِ قَوْقَلٍ . فَقَالَ ابْنُ سَعِيدِ بْنِ الْعَاصِ وَاعَجَبًا لِوَبْرٍ تَدَلَّى عَلَيْنَا مِنْ قَدُومِ ضَأْنٍ، يَنْعَى عَلَىَّ قَتْلَ رَجُلٍ مُسْلِمٍ أَكْرَمَهُ اللَّهُ عَلَى يَدَىَّ وَلَمْ يُهِنِّى عَلَى يَدَيْهِ. [رواه البخاري: ٢٨٢٧]

**1219.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Müsəlmanlar Xeybəri fəth etdikdən sonra mən Peyğəmbərin ﷺ yanına gəlib: "Ya Rəsulullah, (qənimətdən) mənə də pay ayır"– dedim. Bu vaxt Səid ibn əl-As oğullarından bəziləri dedilər: "Ona pay ayırma, ya Rəsulullah!" Əbu Hureyra ﷺ dedi: "Bu ki ibn Qəvqəli öldürən adamdır!" Səid ibn əl-Asın oğlu dedi: "Dağdan düşüb gəlmiş bu çöl siçanına bir baxın! Bir müsəlmanı öldürdüyümə görə məni qınayır. Halbuki, Allah mənim əlimlə ona sayğı göstərmiş[3], məni də onun əli ilə alçaltmamışdır[4]". (əl-Buxari, 2827)

---

[1] Müsəlmanlarla saziş bağlamış və onların tərəfində olacağına söz vermiş bənu-Qureyzə qəbiləsi Xəndək döyüşündə, ittifaq bağlamış müşriklərin tərəfinə keçmişdir. Elə bu səbəbdən də Peyğəmbər ﷺ onlara qarşı vuruşmuşdur.

[2] Söhbət kafir tərəfindən şəhid edilmiş müsəlmandan gedir.

[3] Yəni cihadda ona şəhid olmağı nəsib etmişdir.

[4] Yəni "əgər mən müşrik ikən o, məni öldürmüş olsaydı, zəlil vəziyyətdə Cəhənnəmə düşərdim".

## 14-cü fəsil. Cihadı orucdan üstün tutan kimsə haqqında

## ١٤– باب: مَنِ اخْتَارَ الْغَزْوَ عَلَى الصَّوْمِ

١٢٢٠ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ كَانَ أَبُو طَلْحَةَ لاَ يَصُومُ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ مِنْ أَجْلِ الْغَزْوِ، فَلَمَّا قُبِضَ النَّبِيُّ ﷺ لَمْ أَرَهُ مُفْطِرًا، إِلاَّ يَوْمَ فِطْرٍ أَوْ أَضْحَى. [رواه البخاري: ٢٨٢٨]

**1220.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Əbu Təlhə Peyğəmbərin ﷺ zamanında döyüşlərdə iştirak etdiyi üçün nafilə oruclarını tutmazdı. Peyğəmbər ﷺ vəfat etdikdən sonra isə mən onun bir gün də olsun belə orucu buraxdığını görmədim. Yalnız fitrə və qurban günlərindən başqa[1]". (əl-Buxari, 2828)

## 15-ci fəsil. Cihadda ölənlərdən başqa yeddi sinif şəhid də vardır

## ١٥– باب: الشَّهَادَةُ سَبْعٌ سِوَى الْقَتْلِ

١٢٢١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «الطَّاعُونُ شَهَادَةٌ لِكُلِّ مُسْلِمٍ». [رواه البخاري: ٢٨٣٠]

**1221.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Taun xəstəliyindən (ölən) hər bir müsəlman şəhiddir." (əl-Buxari, 2830)

## 16-cı fəsil. Uca Allahın: "Möminlərdən – üzürlülər istisna olmaqla – *evdə* oturanlarla Allah yolunda öz malları və canları ilə cihad edənlər eyni olmazlar..." ayəsindən "...Allah Bağışlayandır, Rəhmlidir."[2] ayəsinə qədər

## ١٦– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿لَّا يَسْتَوِي ٱلْقَٰعِدُونَ مِنَ ٱلْمُؤْمِنِينَ غَيْرُ أُوْلِي ٱلضَّرَرِ وَٱلْمُجَٰهِدُونَ فِي سَبِيلِ ٱللَّهِ بِأَمْوَٰلِهِمْ وَأَنفُسِهِمْ﴾ إِلَى قَوْلِهِ: ﴿وَكَانَ ٱللَّهُ غَفُورًا رَّحِيمًا﴾

١٢٢٢ – عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ﷺ قَالَ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ أَمْلَى عَلَيْهِ: ﴿لَّا يَسْتَوِي ٱلْقَٰعِدُونَ مِنَ ٱلْمُؤْمِنِينَ وَٱلْمُجَٰهِدُونَ فِي سَبِيلِ ٱللَّهِ ...﴾ قَالَ: فَجَاءَهُ ابْنُ أُمِّ مَكْتُومٍ وَهُوَ يُمِلُّهَا عَلَيَّ، فَقَالَ يَا رَسُولَ اللَّهِ، لَوْ أَسْتَطِيعُ الْجِهَادَ لَجَاهَدْتُ. وَكَانَ رَجُلاً أَعْمَى، فَأَنْزَلَ اللَّهُ تَبَارَكَ وَتَعَالَى عَلَى رَسُولِهِ ﷺ وَفَخِذُهُ عَلَى فَخِذِي، فَثَقُلَتْ عَلَيَّ حَتَّى خِفْتُ أَنْ تَرُضَّ فَخِذِي، ثُمَّ سُرِّيَ عَنْهُ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ: ﴿غَيْرُ أُوْلِي ٱلضَّرَرِ﴾. [رواه البخاري: ٢٨٣٢]

**1222.** Rəvayət edilir ki, Zeyd ibn Sabit ﷺ demişdir: "Peyğəmbər ﷺ bu ayəni mənə yazdırmışdı: "Möminlərdən *evdə* oturanlarla Allah yolunda öz malları və canları ilə cihad edənlər eyni olmazlar..." Peyğəmbər ﷺ ayəni mənə diktə

---

[1] Bayram günləri.
[2] "ən-Nisa" surəsi, 95-96.

edərkən ibn Ummu Məktum gəlib dedi: "Ya Rəsulullah! Əgər mən vuruşa bilsəydim, vuruşardım." O, kor idi. Bu vaxt Uca Allah Öz elçisinə – onun ayağı mənim ayağımın üstündə ikən ayə nazil etdi və (həmin an) ayağıma elə bir ağırlıq düşdü ki, mən ayağımın xıncım-xıncım olacağından qorxdum. Peyğəmbər ﷺ özünə gəldikdən sonra (aydın oldu ki,) qüdrətli və böyük Allah (ona) bu (sözü) nazil etmişdir: "...üzürlülər istisna olmaqla.." (əl-Buxari, 2832)

## 17-ci fəsil. Döyüşə təhrik etmək

## ١٧– باب: التَّحْرِيضُ عَلَى الْقِتَالِ

١٢٢٣ – عَنْ أَنَسٍ ﷺ قَالَ: خَرَجَ رَسُولُ اللَّهِ ﷺ إِلَى الْخَنْدَقِ فَإِذَا الْمُهَاجِرُونَ وَالأَنْصَارُ يَحْفِرُونَ فِى غَدَاةٍ بَارِدَةٍ، فَلَمْ يَكُنْ لَهُمْ عَبِيدٌ يَعْمَلُونَ ذَلِكَ لَهُمْ، فَلَمَّا رَأَى مَا بِهِمْ مِنَ النَّصَبِ وَالْجُوعِ قَالَ:

اللَّهُمَّ إِنَّ الْعَيْشَ عَيْشُ الآخِرَهْ فَاغْفِرْ لِلأَنْصَارِ وَالْمُهَاجِرَهْ.

فَقَالُوا مُجِيبِينَ لَهُ:

نَحْنُ الَّذِينَ بَايَعُوا مُحَمَّدًا عَلَى الْجِهَادِ مَا بَقِينَا أَبَدًا.

[رواه البخاري: ٢٨٣٤]

**1223.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ xəndək qazılan yerə gəlib mühacirlərin və ənsarın səhərin soyuğunda yer qazdığını gördü. Əshabələrin köləlləri yox idi ki, onların əvəzinə bu işi görsünlər. Peyğəmbər ﷺ onların yorğunluq və aclıqdan əziyyət çəkdiyini gördükdə dedi:

Allahım, həyat – məhz axirət həyatıdır,
Sən ənsarı və mühacirləri bağışla!"

(Əshabələr) dedilər:

*Bizik Muhəmmədə beyət edənlər,*
*Canımız sağ ikən, cihad edənlər."* (əl-Buxari, 2834)

## 18-ci fəsil. Xəndək qazmaq

## ١٨– باب: حَفْرُ الْخَنْدَقِ

١٢٢٤ – عَنْ أَنَسٍ ﷺ قَالَ: جَعَلَ الْمُهَاجِرُونَ وَالأَنْصَارُ يَحْفِرُونَ الْخَنْدَقَ حَوْلَ الْمَدِينَةِ، وَيَنْقُلُونَ التُّرَابَ عَلَى مُتُونِهِمْ وَيَقُولُونَ:

نَحْنُ الَّذِينَ بَايَعُوا مُحَمَّدًا عَلَى الإِسْلاَمِ مَا بَقِينَا أَبَدًا

وَالنَّبِىُّ ﷺ يُجِيبُهُمْ وَيَقُولُ:

اللَّهُمَّ إِنَّهُ لاَ خَيْرَ إِلاَّ خَيْرُ الآخِرَهْ فَبَارِكْ فِى الأَنْصَارِ وَالْمُهَاجِرَهْ.

[رواه البخاري: ٢٨٣٥]

**1224.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Mühacirlər və ənsar Mədinənin ətrafında xəndək qazır və (xəndəkdən çıxan) torpağı çiyinlərində daşıya-daşıya deyirdilər:

*Bizik Muhəmmədə beyət edənlər,*
*Canımız sağ ikən, cihad edənlər.*

Peyğəmbər ﷺ onlara cavabında deyərdi:
Allahım, xeyir ancaq axirət xeyiridir,
Sən ənsara və mühacirlərə xeyir-bərəkət ver!"
(əl-Buxari, 2835)

١٢٢٥ – عَنْ الْبَرَاءِ ﷺ قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَوْمَ الأَحْزَابِ يَنْقُلُ التُّرَابَ وَقَدْ وَارَى التُّرَابُ بَيَاضَ بَطْنِهِ، وَهُوَ يَقُولُ:
لَوْلاَ أَنْتَ مَا اهْتَدَيْنَا وَلاَ تَصَدَّقْنَا وَلاَ صَلَّيْنَا.
فَأَنْزِل السَّكِينَةَ عَلَيْنَا وَثَبِّت الأَقْدَامَ إِنْ لاَقَيْنَا.
إِنَّ الأُلَى قَدْ بَغَوْا عَلَيْنَا إِذَا أَرَادُوا فِتْنَةً أَبَيْنَا. [رواه البخاري: ٢٨٣٧]

**1225.** Rəvayət edilir ki, Bəra ﷺ demişdir: "Müttəfiqlərin (Mədinəyə yürüş etdiyi) vaxt mən Peyğəmbərin ﷺ qarnının toz-torpağa bulaşdığını, özünün də (şeir[1]) dediyini gördüm:

*Sən olmasaydın əgər, düz yola gəlməzdik biz,*
*Nə sədəqə verərdik, nə namaz qılardıq biz.*
*Odur ki, bir təskinlik, Özün nazil et bizə,*
*Sabit et qədəmləri, düşmən gəldikdə bizə.*
*Doğrusu bu adamlar,[2] təcavüz edir bizə,*
*Hərgah fitnə salsalar, bata bilməzlər bizə.*

(əl-Buxari, 2837)

## 19-cu fəsil. Üzrlü səbəbə görə döyüşdən yayınan kimsə

## ١٩– باب: مَنْ حَبَسَهُ الْعُذْرُ عَنِ الْغَزْوِ

١٢٢٦ – عَنْ أَنَسٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ فِي غَزَاةٍ فَقَالَ: «إِنَّ أَقْوَامًا بِالْمَدِينَةِ خَلْفَنَا، مَا سَلَكْنَا شِعْبًا وَلاَ وَادِيًا إِلاَّ وَهُمْ مَعَنَا فِيهِ، حَبَسَهُمُ الْعُذْرُ». [رواه البخاري: ٢٨٣٩]

**1226.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ döyüşlərin birində belə demişdir: "Bizdən sonra Mədinədə qalan elə insanlar var ki, keçdiyimiz hər bir dərədə və vadidə onlar bizimlədir. Onlar üzrlü səbəbə görə (döyüşdən) yayınmışlar." (əl-Buxari, 2839)

## 20-ci fəsil. Allah yolunda oruc tutmağın fəziləti

## ٢٠– باب: فَضْلُ الصَّوْمِ فِي سَبِيلِ اللَّهِ

١٢٢٧ – عَنْ أَبِي سَعِيدٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «مَنْ صَامَ يَوْمًا فِي سَبِيلِ اللَّهِ بَعَّدَ اللَّهُ وَجْهَهُ عَنِ النَّارِ سَبْعِينَ خَرِيفًا». [رواه البخاري: ٢٨٤٠]

---

[1] Bu, Abdullah ibn Rəvahanın ﷺ şeiridir. Peyğəmbər çox vaxt onun şeirlərindən deyərdi. Rəvayət edilir ki, Şureyh demişdir: "Mən Aişədən ﷺ soruşdum: "Peyğəmbər ﷺ şeir deyərdimi?" Aişə ﷺ dedi: "Peyğəmbər ﷺ (çox vaxt) Abdullah ibn Rəvahənin ﷺ şeirlərindən oxuyub deyərdi: "Sənə xəbər gətirər, təmin etmədiyin kəs!" (Səhih Ədəbul-Mufrad, 867-ci hədis).

[2] Burada o, müsəlmanların əleyhinə ittifaq etmiş müşrikləri qəsd edir.

**1227.** Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim Allah yolunda bir gün oruc tutarsa, Allah onun üzünü Cəhənnəm odundan yetmiş illik (məsafəyədək) uzaqlaşdırar." (əl-Buxari, 2840)

## 21-ci fəsil. Mücahidi təchiz etməyin və ya onun (ailəsinə baxmağın) fəziləti

## ٢١– باب: فَضْلُ مَنْ جَهَّزَ غَازِيًا أَوْ خَلَفَهُ بِخَيْرٍ

١٢٢٨ – عَنْ زَيْدِ بْنِ خَالِدٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَنْ جَهَّزَ غَازِيًا فِى سَبِيلِ اللَّهِ فَقَدْ غَزَا، وَمَنْ خَلَفَ غَازِيًا فِى سَبِيلِ اللَّهِ بِخَيْرٍ فَقَدْ غَزَا». [رواه البخاري: ٢٨٤٣]

**1228.** Zeyd ibn Xalid ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Allah yolunda bir mücahidi təchiz edərsə, (özü də) cihad etmiş sayılar; habelə kim Allah yolunda bir mücahidin ailəsinə yaxşılıq edərsə, (özü də) cihad etmiş sayılar. (əl-Buxari, 2843)

١٢٢٩ – عَنْ أَنَسٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ لَمْ يَكُنْ يَدْخُلُ بَيْتًا بِالْمَدِينَةِ غَيْرَ بَيْتِ أُمِّ سُلَيْمٍ، إِلاَّ عَلَى أَزْوَاجِهِ فَقِيلَ لَهُ، فَقَالَ: «إِنِّى أَرْحَمُهَا، قُتِلَ أَخُوهَا مَعِى». [رواه البخاري: ٢٨٤٤]

**1229.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Mədinədə, – zövcələrinin evi istisna olmaqla, – Ummu Suleymin evindən başqa heç bir evə girməzdi. (Bunun səbəbini ondan) soruşduqda isə belə demişdir: "Mənim ona yazığım gəlir; onun qardaşı mənimlə bir döyüşdə ikən şəhid olmuşdur." (əl-Buxari, 2844)

## 22-ci fəsil. Döyüşdə hənutdan[1] istifadə etmək

## ٢٢– باب: التَّحَنُّطُ عِنْدَ الْقِتَالِ

١٢٣٠ – عَنْ أَنَسٍ ﷺ أَنَّهُ أَتَى يَوْمَ الْيَمَامَةِ ثَابِتَ بْنَ قَيْسٍ وَقَدْ حَسَرَ عَنْ فَخِذَيْهِ وَهُوَ يَتَحَنَّطُ فَقَالَ: يَا عَمِّ مَا يَحْبِسُكَ أَنْ لاَ تَجِيءَ قَالَ الآنَ يَا ابْنَ أَخِى. وَجَعَلَ يَتَحَنَّطُ، يَعْنِى مِنَ الْحَنُوطِ، ثُمَّ جَاءَ فَجَلَسَ، فَذَكَرَ فِى الْحَدِيثِ انْكِشَافًا مِنَ النَّاسِ، فَقَالَ هَكَذَا عَنْ وُجُوهِنَا حَتَّى نُضَارِبَ الْقَوْمَ، مَا هَكَذَا كُنَّا نَفْعَلُ مَعَ رَسُولِ اللَّهِ ﷺ، بِئْسَ مَا عَوَّدْتُمْ أَقْرَانَكُمْ. [رواه البخاري: ٢٨٤٥]

**1230.** Rəvayət edilir ki, Ənəs ﷺ Yəmamə günü[2] Sabit ibn Qeysin ﷺ yanına gəlikdə o, ayaqlarına (dizdən baldıra qədər) hənut sürtürdü. Ənəs dedi: "Əmi, səni (döyüşdən) saxlayan nədir?" O: "Gəlirəm, qardaş oğlu!"– dedi və (ayaqlarına) ətir sürtməyə davam etdi. Sonra o gəlib (döyüşçülərin arasında) oturdu.

Ənəs hədisi davam edib demişdir: "(Döyüşdə) bəziləri düşmənin qabağından qaçarkən Sabit dedi: "Çəkilin gözümüzün qabağından! Qoyun biz onlarla vuruşaq! Biz Peyğəmbərlə ﷺ birlikdə vuruşarkən belə hərəkət etməzdik. Siz düşmənlərinizi çox pis öyrətmisiniz![3]" (əl-Buxari, 2845)

---

[1] Ölənlərə vurulan ətir.

[2] Söhbət 634-cü ildə, özünü peyğəmbər elan etmiş yalançı Müseyləməyə qarşı aparılan döyüşdən gedir.

[3] Yəni siz onlarda elə təsəvvür yaratmısınız və artıq onlar elə düşünməyə başlamışlar ki, onlar müsəlmanları qorxudub döyüş meydanından qaçmağa məcbur edə bilərlər.

## 23-cü fəsil. Kəşfiyyata getməyin fəziləti

## ٢٣– باب: فَضْلُ الطَّلِيعَةِ

١٢٣١ – عَنْ جَابِرٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «مَنْ يَأْتِينِي بِخَبَرِ الْقَوْمِ» يَوْمَ الأَحْزَابِ. قَالَ الزُّبَيْرُ أَنَا. ثُمَّ قَالَ: «مَنْ يَأْتِينِي بِخَبَرِ الْقَوْمِ». قَالَ الزُّبَيْرُ أَنَا. فَقَالَ النَّبِيُّ ﷺ: «إِنَّ لِكُلِّ نَبِيٍّ حَوَارِيًّا، وَحَوَارِيَّ الزُّبَيْرُ». [رواه البخاري: ٢٨٤٦]

**1231.** Cabir ﷺ rəvayət edir ki, əhzab günü[1] Peyğəmbər ﷺ soruşdu: "Kim gedib mənə bu adamlardan xəbər gətirər?" Zubeyr: "Mən (gedərəm)!"– dedi. Peyğəmbər ﷺ (bir də) soruşdu: "Kim gedib mənə bu adamlardan xəbər gətirər?" (Yenə) Zubeyr: "Mən (gedərəm)!"– dedi. Onda Peyğəmbər ﷺ buyurdu: "Hər bir peyğəmbərin həvarisi (ən yaxın köməkçisi) olmuşdur. Mənim də həvarim, Zubeyrdir!" (əl-Buxari, 2846)

## 24-cü fəsil. Qiyamət gününədək atların yüyənində xeyir qalacaqdır

## ٢٤– باب: الْخَيْلُ مَعْقُودٌ فِي نَوَاصِيهَا الْخَيْرُ إِلَى يَوْمِ الْقِيَامَةِ

١٢٣٢ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «الْبَرَكَةُ فِي نَوَاصِي الْخَيْلِ». [رواه البخاري: ٢٨٥١]

**1232.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bərəkət atın yüyənindədir." (əl-Buxari, 2851)

## 25-ci fəsil. (İmam) ədalətli də olsa, günahkar da olsa (onun rəhbərliyi) altında döyüşmək lazımdır

## ٢٥– باب: الْجِهَادُ مَاضٍ مَعَ الْبَرِّ وَالْفَاجِرِ

١٢٣٣ – عَنْ عُرْوَةَ الْبَارِقِيِّ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «الْخَيْلُ مَعْقُودٌ فِي نَوَاصِيهَا الْخَيْرُ إِلَى يَوْمِ الْقِيَامَةِ الأَجْرُ وَالْمَغْنَمُ». [رواه البخاري: ٢٨٥٢]

**1233.** Urva əl-Bariqi ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət gününədək atların yüyənində xeyir qalacaqdır. (İnsanlar onların sayəsində çoxlu) savab və qənimətlər (əldə edəcəklər)." (əl-Buxari, 2852)

## 26-cı fəsil. Uca Allahın: "...döyüş atları hazırlayın..."[2] sözünə görə atını hazırlayan kimsə haqqında

## ٢٦– باب: مَنِ احْتَبَسَ فَرَسًا لِقَوْلِهِ تَعَالَى: ﴿وَمِن رِّبَاطِ ٱلْخَيْلِ﴾

١٢٣٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «مَنِ احْتَبَسَ فَرَسًا فِي سَبِيلِ اللَّهِ إِيمَانًا بِاللَّهِ وَتَصْدِيقًا بِوَعْدِهِ، فَإِنَّ شِبَعَهُ وَرِيَّهُ وَرَوْثَهُ وَبَوْلَهُ فِي مِيزَانِهِ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٢٨٥٣]

[1] Söhbət Xəndək döyüşündən gedir.
[2] "əl-Ənfal" surəsi, 60.

**1234.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Allaha iman gətirərək və Onun verdiyi vədi təsdiq edərək Allah yolunda (istifadə etmək məqsədilə) bir at saxlayarsa, bu atın yediyi, içdiyi, nəcisi və sidiyi Qiyamət günü onun (əməl) tərəzisinə qoyular (beləliklə də, mükafatı üstünə mükafat artırılar)." (əl-Buxari, 2853)

## 27-ci fəsil. Ata və uzunqulağa ad vermək

## ٢٧- باب: اسْمُ الْفَرَسِ وَالْحِمَارِ

١٢٣٥ - عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﷺ قَالَ: كَانَ لِلنَّبِيِّ ﷺ فِي حَائِطِنَا فَرَسٌ يُقَالُ لَهُ اللُّحَيْفُ. [رواه البخاري: ٢٨٥٥]

**1235.** Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ demişdir: "Bizim bağımızda Peyğəmbərin ﷺ Luheyf[1] deyilən bir atı var idi." (əl-Buxari, 2855)

١٢٣٦ - عَنْ مُعَاذٍ ﷺ قَالَ كُنْتُ رِدْفَ النَّبِيِّ ﷺ عَلَى حِمَارٍ يُقَالُ لَهُ عُفَيْرٌ، فَقَالَ: «يَا مُعَاذُ، هَلْ تَدْرِي حَقَّ اللَّهِ عَلَى عِبَادِهِ وَمَا حَقُّ الْعِبَادِ عَلَى اللَّهِ». قُلْتُ اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: «فَإِنَّ حَقَّ اللَّهِ عَلَى الْعِبَادِ أَنْ يَعْبُدُوهُ وَلاَ يُشْرِكُوا بِهِ شَيْئًا، وَحَقَّ الْعِبَادِ عَلَى اللَّهِ أَنْ لاَ يُعَذِّبَ مَنْ لاَ يُشْرِكُ بِهِ شَيْئًا». فَقُلْتُ يَا رَسُولَ اللَّهِ، أَفَلاَ أُبَشِّرُ بِهِ النَّاسَ قَالَ: «لاَ تُبَشِّرْهُمْ فَيَتَّكِلُوا». [رواه البخاري: ٢٨٥٦]

**1236.** Rəvayət edilir ki, Muaz ﷺ demişdir: "Mən Peyğəmbərlə ﷺ birlikdə onun Ufeyr[2] adlı uzunqulağına minmişdim. (Mən Peyğəmbərin ﷺ tərkində ikən) o dedi: "Ey Muaz, bilirsən Allahın qulları üzərindəki haqqı və qulların da Allah üzərindəki haqqı nədir?" Mən: "Allah və Onun rəsulu daha yaxşı bilir!"– dedim. O buyurdu: "Allahın qulları üzərindəki haqqı, qulların Ona ibadət edib heç kəsi Ona şərik qoşmamalarıdır. Qulların Allah üzərindəki haqqı isə, Ona heç nəyi şərik qoşmayan qullarına əzab verməməsidir." Mən dedim: "Ya Rəsulullah, bu xəbərlə camaatı müjdələyimmi?" O buyurdu: "Müjdələmə, (yoxsa) onlar (buna) arxayın olacaqlar." (əl-Buxari, 2856)

١٢٣٧ - عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: كَانَ فَزَعٌ بِالْمَدِينَةِ، فَاسْتَعَارَ النَّبِيُّ ﷺ فَرَسًا لَنَا يُقَالُ لَهُ مَنْدُوبٌ. فَقَالَ: «مَا رَأَيْنَا مِنْ فَزَعٍ، وَإِنْ وَجَدْنَاهُ لَبَحْرًا». [رواه البخاري: ٢٨٥٧]

**1237.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) Mədinədə (insanları təşvişə salan) bir gurultu qopdu. Bu vaxt Peyğəmbər ﷺ bizim Məndub[3] adlı atımızı borc aldı (və atı dördnala çapıb getdi. Geri qayıtdıqdan sonra isə) dedi: "Qorxulu bir şey yoxdur; ancaq bu (Məndub) olduqca itiqaçan bir atdır." (əl-Buxari, 2857)

## 28-ci fəsil. Atın uğursuzluğu haqqında deyilənlər

## ٢٨- باب: مَا يُذْكَرُ مِنْ شُؤْمِ الْفَرَسِ

١٢٣٨ - عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «إِنَّمَا الشُّؤْمُ فِي ثَلاَثَةٍ فِي الْفَرَسِ وَالْمَرْأَةِ وَالدَّارِ». [رواه البخاري: ٢٨٥٨]

[1] Hərfi tərcüməsi "uzunquyruq" deməkdir.
[2] Hərfi tərcüməsi "qırmızılı-ağlı" deməkdir.
[3] Hərfi tərcüməsi "itiqaçan" deməkdir.

**1238.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷠ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Uğursuzluq ancaq üç şeydədir: atda, qadında və evdə[1]”. (əl-Buxari, 2858)

## 29-cu fəsil. Qənimətdən ata görə verilən pay

## ٢٩– باب: سِهَامُ الْفَرَسِ

١٢٣٩ – عَنْ ابْنِ عُمَرَ ﷠ أَنَّ رَسُولَ اللَّهِ ﷺ جَعَلَ لِلْفَرَسِ سَهْمَيْنِ وَلِصَاحِبِهِ سَهْمًا. [رواه البخاري: ٢٨٦٣]

**1239.** İbn Ömər ﷛ rəvayət edir ki, Peyğəmbər ﷺ (qənimətlərdən) at üçün iki pay, sahibinə isə bir pay ayırmışdı.[2]” (əl-Buxari, 2863)

## 30-cu fəsil. Döyüşdə başqasının minik heyvanının yüyənindən tutub aparmaq

## ٣٠– باب: مَنْ قَادَ دَابَّةَ غَيْرِهِ فِي الْحَرْبِ

١٢٤٠ – عَنْ الْبَرَاءِ بْنِ عَازِبٍ ﷛ أَنَّهُ قَالَ لَهُ رَجُلٌ: أَفَرَرْتُمْ عَنْ رَسُولِ اللَّهِ ﷺ يَوْمَ حُنَيْنٍ قَالَ لَكِنَّ رَسُولَ اللَّهِ ﷺ لَمْ يَفِرَّ، إِنَّ هَوَازِنَ كَانُوا قَوْمًا رُمَاةً، وَإِنَّا لَمَّا لَقِينَاهُمْ حَمَلْنَا عَلَيْهِمْ فَانْهَزَمُوا، فَأَقْبَلَ الْمُسْلِمُونَ عَلَى الْغَنَائِمِ وَاسْتَقْبَلُونَا بِالسِّهَامِ، فَأَمَّا رَسُولُ اللَّهِ ﷺ فَلَمْ يَفِرَّ، فَلَقَدْ رَأَيْتُهُ وَإِنَّهُ لَعَلَى بَغْلَتِهِ الْبَيْضَاءِ وَإِنَّ أَبَا سُفْيَانَ آخِذٌ بِلِجَامِهَا، وَالنَّبِيُّ ﷺ يَقُولُ: «أَنَا النَّبِيُّ لاَ كَذِبْ أَنَا ابْنُ عَبْدِ الْمُطَّلِبْ». [رواه البخاري: ٢٨٦٤]

**1240.** Rəvayət edilir ki, bir nəfər Bəra ibn Azibdən ﷛ soruşdu: “Siz Huneyn döyüşündə Allahın elçisini ﷺ qoyub qaçmısınızmı?” Bəra dedi: “(Düzdür,) lakin Allahın elçisi ﷺ qaçmadı. Həvazin qəbiləsi (sərrast) ox atmaqda məşhur idi. Biz onlarla qarşı-qarşıya gəldikdə üzərlərinə hücum etdik və onlar dağılıb geri çəkildilər. Müsəlmanlar qənimət toplamağa başladıqda onlar bizi ox atəşinə tutdular. Allahın elçisinə ﷺ gəlincə, o (bu həngamədə heç yerə) qaçmadı. Mən onu ağ qatırının üstündə oturan gördüm. Həmin vaxt Əbu Süfyan qatırın yüyənindən tutmuşdu. Peyğəmbər ﷺ isə deyirdi:

*Yalan deyil, mən peyğəmbərəm!*
*Mən Abdulmuttəlibin oğluyam[3]!”*

(əl-Buxari, 2864)

[1] İbn Həcər bu hədisi açıqlayıb demişdir: “İmam Muslimin rəvayət etdiyi hədis bu hədisi tam açıqlayır. Həmin hədisdə Peyğəmbər ﷺ demişdir: “Əgər uğursuzluq həqiqət olsaydı, atda, qadında və evdə olardı.” (Səhih Muslim, 5943) Maziri demişdir: “Bu rəvayətlərin hamısını cəm edib demək olar ki, əgər uğursuzluq gerçək olsaydı, bu üç şeydə olardı. Çünki insanın nəfsi əsasən bu üç şeyə meyillidir.” (Fəthul-Bari, 8/484) əl-Albani Peyğəmbərin ﷺ: “Əgər nədə isə uğursuzluq olmuş olsaydı, bu, qadında, atda və evdə olardı” hədisini nəql etdikdən sonra demişdir: “Hədisdən belə nəticə çıxır ki, heç bir şeydə uğursuzluq ola bilməz. Əgər nədə isə uğursuzluq olmuş olsaydı, bu üç şeydə olardı. Lakin heç bir şeydə əsla uğursuzluq yoxdur” (Silsilətul-Əhadisis-Səhihə, 1/804; 442-ci hədisin izahı).

[2] Burada atı ilə vuruşmuş mücahidə özünə verilən bir paydan əlavə iki pay da artıq verilir. Beləliklə də ona qənimətdən üç pay çatır.

[3] Yəni “mən onun nəslindənəm”.

## ٣١– باب: نَاقَةُ النَّبِيِّ ﷺ

## 31-ci fəsil. Peyğəmbərin ﷺ dəvəsi

١٢٤١ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ لِلنَّبِيِّ ﷺ نَاقَةٌ تُسَمَّى الْعَضْبَاءَ لاَ تُسْبَقُ، فَجَاءَ أَعْرَابِيٌّ عَلَى قَعُودٍ فَسَبَقَهَا، فَشَقَّ ذَلِكَ عَلَى الْمُسْلِمِينَ، حَتَّى عَرَفَهُ فَقَالَ: «حَقٌّ عَلَى اللَّهِ أَنْ لاَ يَرْتَفِعَ شَيْءٌ مِنَ الدُّنْيَا إِلاَّ وَضَعَهُ». [رواه البخاري: ٢٨٧٢]

**1241.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Peyğəmbərin ﷺ Ədba[1] adlı dəvəsi var idi. Bu dəvəni heç kəs keçə bilmirdi. (Bir dəfə) bir bədəvi yaşı altıdan az olan bir dəvənin üstündə gəlib Ədbanı keçdi. Bu, müsəlmanlara çox ağır gəldi. Peyğəmbər ﷺ onların halının pərişan olduğunu görüb dedi: "Dünyada ucalan elə bir şey yoxdur ki, zamanı yetişdikdə Allah onu nüfuzdan salmasın." (əl-Buxari, 2872)

## ٣٢– باب: حَمْلُ النِّسَاءِ الْقِرَبَ إِلَى النَّاسِ فِي الْغَزْوِ

## 32-ci fəsil. Qadınların döyüş əsnasında mücahidlərə tuluqlarda su daşıması

١٢٤٢ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ ﷺ قَسَمَ مُرُوطًا بَيْنَ نِسَاءٍ مِنْ نِسَاءِ الْمَدِينَةِ، فَبَقِيَ مِرْطٌ جَيِّدٌ فَقَالَ لَهُ بَعْضُ مَنْ عِنْدَهُ يَا أَمِيرَ الْمُؤْمِنِينَ أَعْطِ هَذَا ابْنَةَ رَسُولِ اللَّهِ ﷺ الَّتِي عِنْدَكَ. يُرِيدُونَ أُمَّ كُلْثُومٍ بِنْتَ عَلِيٍّ. فَقَالَ عُمَرُ أُمُّ سَلِيطٍ أَحَقُّ. وَأُمُّ سَلِيطٍ مِنْ نِسَاءِ الأَنْصَارِ، مِمَّنْ بَايَعَ رَسُولَ اللَّهِ ﷺ. قَالَ عُمَرُ فَإِنَّهَا كَانَتْ تَزْفِرُ لَنَا الْقِرَبَ يَوْمَ أُحُدٍ. [رواه البخاري: ٢٨٨١]

**1242.** Rəvayət edilir ki, Ömər ibn Xəttab ﷺ ipək bürüncəkləri Mədinədəki qadınların arasında paylaşdırdı və axıra bir gözəl bürüncək qaldı. Yanındakılardan bəziləri dedilər: "Ey möminlərin əmiri, bunu öz həyat yoldaşına – Peyğəmbərin ﷺ qızına ver." (Bunu deyəndə) onlar Əlinin qızı Ummu Gülsümü nəzərdə tuturdular. Ömər dedi: "Ummu Səlit buna daha çox layiqdir." Ummu Səlit ənsardan idi və vaxtı ilə Peyğəmbərə ﷺ beyət etmişdi. Ömər dedi: "Bu qadın Uhud döyüşündə bizlərə tuluqlarda su daşıyırdı." (əl-Buxari, 2881)

## ٣٣– باب: مُدَاوَاةُ النِّسَاءِ الْجَرْحَى فِي الْغَزْوِ

## 33-cü fəsil. Qadınların döyüş əsnasında yaralılara yardım etməsi

١٢٤٣ – عَنْ الرُّبَيِّعِ بِنْتِ مُعَوِّذٍ ﷺ قَالَتْ: كُنَّا نَغْزُو مَعَ النَّبِيِّ ﷺ فَنَسْقِي الْقَوْمَ وَنَخْدُمُهُمْ، وَنَرُدُّ الْجَرْحَى وَالْقَتْلَى إِلَى الْمَدِينَةِ. [رواه البخاري: ٢٨٨٢]

**1243.** Rəvayət edilir ki, Rubeyyi bint Muəvviz ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə döyüşlərdə iştirak edərdik; (döyüş əsnasında biz) döyüşçülərə su daşıyar və (digər) xidmətlər göstərərdik, üstəlik yaralıları və ölənləri Mədinəyə gətirərdik. " (əl-Buxari, 2882)

[1] Hərfi tərcüməsi "qulağı kəsilmiş və ya qulağı çərtilmiş" deməkdir.

## 34-cü fəsil. Allah yolunda aparılan döyüşdə keşik çəkmək

## ٣٤– باب: الْحِرَاسَةُ فِى الْغَزْوِ فِى سَبِيلِ اللَّهِ

١٢٤٤ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كَانَ النَّبِيُّ ﷺ سَهِرَ فَلَمَّا قَدِمَ الْمَدِينَةَ قَالَ: «لَيْتَ رَجُلاً مِنْ أَصْحَابِى صَالِحًا يَحْرُسُنِى اللَّيْلَةَ». إِذْ سَمِعْنَا صَوْتَ سِلاَحٍ فَقَالَ: «مَنْ هَذَا؟» فَقَالَ أَنَا سَعْدُ بْنُ أَبِى وَقَّاصٍ، جِئْتُ لأَحْرُسَكَ. وَنَامَ النَّبِيُّ ﷺ. [رواه البخاري: ٢٨٨٥]

**1244.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ (səfərdə ikən) səhərə qədər yatmadı. Sonra Mədinəyə gəlib çatdıqda dedi: "Nə olaydı, əshabələrimdən əməlisaleh bir adam bu gecə məni mühafizə edəydi." Bunu deyən kimi biz silah səsi eşitdik. Peyğəmbər ﷺ: "Kimdir bu?"– deyə soruşdu. (Gələn adam) dedi: "Mənəm – Səd ibn Əbu Vəqqas! Gəlmişəm səni mühafizə edim." (Bundan sonra) Peyğəmbər ﷺ yatdı." (əl-Buxari, 2885)

١٢٤٥ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ: «تَعِسَ عَبْدُ الدِّينَارِ وَعَبْدُ الدِّرْهَمِ وَعَبْدُ الْخَمِيصَةِ، إِنْ أُعْطِىَ رَضِىَ، وَإِنْ لَمْ يُعْطَ سَخِطَ، تَعِسَ وَانْتَكَسَ، وَإِذَا شِيكَ فَلاَ انْتَقَشَ، طُوبَى لِعَبْدٍ آخِذٍ بِعِنَانِ فَرَسِهِ فِى سَبِيلِ اللَّهِ، أَشْعَثَ رَأْسُهُ مُغْبَرَّةٍ قَدَمَاهُ، إِنْ كَانَ فِى الْحِرَاسَةِ كَانَ فِى الْحِرَاسَةِ، وَإِنْ كَانَ فِى السَّاقَةِ كَانَ فِى السَّاقَةِ، إِنِ اسْتَأْذَنَ لَمْ يُؤْذَنْ لَهُ، وَإِنْ شَفَعَ لَمْ يُشَفَّعْ». [رواه البخاري: ٢٨٨٧]

**1245.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Dinarın qulu, dirhəmin qulu və zər-zibalı paltarın qulu bədbəxt olsun! (Beləsinə bir şey) verilsə, razı qalar, verilməsə, qəzəblənər. Beləsi bədbəxt olsun, azar canından çıxmasın və bədəninə batan tikanı çıxardacaq bir kimsə tapılmasın!

Saçları dağınıq və ayaqları toz-torpağa bulaşmış halda Allah yolunda (cihad edərkən) atının cilovundan tutan bəndənin xoş halına! Beləsinə (müsəlmanların rifahı naminə) keşik çəkmək tapşırılarsa, (onların) keşiyində durar, arxaya göndərilərsə, arxada durar. (Özü də təvazökar olduğundan bir iş üçün) izn istəsə, ona izn verilməz, havadarlıq etsə, havadarlığı keçməz." (əl-Buxari, 2887)

## 35-ci fəsil. Döyüşdə xidmət etməyin fəziləti

## ٣٥– باب: فَضْلُ الْخِدْمَةِ فِى الْغَزْوِ

١٢٤٦ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: خَرَجْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ إِلَى خَيْبَرَ أَخْدُمُهُ، فَلَمَّا قَدِمَ النَّبِيُّ ﷺ رَاجِعًا، وَبَدَا لَهُ أُحُدٌ قَالَ: «هَذَا جَبَلٌ يُحِبُّنَا وَنُحِبُّهُ». [رواه البخاري: ٢٨٨٩]

**1246.** Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه demişdir: "(Bir dəfə) mən Peyğəmbərlə ﷺ birgə Xeybərə gedərkən onun xidmətində oldum. (Xeybərdən) qayıdarkən o, Uhud dağına rast gəldikdə dedi: "Bu dağ bizi sevir, biz də onu sevirik." (əl-Buxari, 2889)

١٢٤٧ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ أَكْثَرُنَا ظِلاًّ الَّذِى يَسْتَظِلُّ بِكِسَائِهِ، وَأَمَّا الَّذِينَ صَامُوا فَلَمْ يَعْمَلُوا شَيْئًا، وَأَمَّا الَّذِينَ أَفْطَرُوا فَبَعَثُوا الرِّكَابَ وَامْتَهَنُوا وَعَالَجُوا فَقَالَ النَّبِيُّ ﷺ: «ذَهَبَ الْمُفْطِرُونَ الْيَوْمَ بِالأَجْرِ». [رواه البخاري: ٢٨٩٠]

**1247.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) biz Peyğəmbərlə ﷺ birlikdə (səfərə çıxmışdıq). Əksəriyyətimiz əbalarını başlarına tutmaqla özlərini günün istisindən qoruyurdu. Oruc tutanlara gəlincə, onlar heç bir iş görmürdülər. Oruc tutmayanlara gəldikdə isə, onlar dəvələri sulayır və yemləyir, habelə (oruc tutanlara) xidmət edir və yardım göstərirdilər. (Onların canfəşanlığını görən) Peyğəmbər ﷺ buyurdu: "Bu gün savabın (hamısını) oruc tutmayanlar qazandı." (əl-Buxari, 2890)

## ٣٦- باب: فَضْلُ رِبَاطِ يَوْمٍ فِي سَبِيلِ اللَّهِ وَقَوْلِ اللَّهِ تَعَالَى: ﴿ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اصْبِرُوا وَصَابِرُوا وَرَابِطُوا وَاتَّقُوا اللَّهَ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴾

## 36-cı fəsil. Allah yolunda sərhəddə keşik çəkməyin fəziləti. Uca Allah buyurur: "Ey iman gətirənlər! Səbir edin, dözümlü olun, *sərhəd boyu* növbə ilə keşik çəkin və Allahdan qorxun ki, bəlkə nicat tapasınız!"[1]

١٢٤٨ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ السَّاعِدِيِّ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «رِبَاطُ يَوْمٍ فِي سَبِيلِ اللَّهِ خَيْرٌ مِنَ الدُّنْيَا وَمَا عَلَيْهَا، وَمَوْضِعُ سَوْطِ أَحَدِكُمْ مِنَ الْجَنَّةِ خَيْرٌ مِنَ الدُّنْيَا وَمَا عَلَيْهَا، وَالرَّوْحَةُ يَرُوحُهَا الْعَبْدُ فِي سَبِيلِ اللَّهِ أَوِ الْغَدْوَةُ خَيْرٌ مِنَ الدُّنْيَا وَمَا عَلَيْهَا». [رواه البخاري: ٢٨٩٢]

**1248.** Səhl ibn Səd əs-Saidi ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah yolunda bir gün sərhəddə keşik çəkmək, dünya və onun üzərindəkilərdən daha xeyirlidir. Birinizin Cənnətdəki qamçısı boyda yeri, dünya və onun üzərindəkilərdən daha xeyirlidir. Bəndənin Allah yolunda səhər və ya axşam (döyüşə) getməsi, dünya və onun üzərindəkilərdən daha xeyirlidir." (əl-Buxari, 2892)

## ٣٧- باب: مَنِ اسْتَعَانَ بِالضُّعَفَاءِ وَالصَّالِحِينَ فِي الْحَرْبِ

## 37-ci fəsil. Döyüşdə zəiflərin və əməlisaleh insanların (duaları vasitəsilə Allahdan) kömək diləmək

١٢٤٩ – عَنْ مُصْعَبِ بْنِ سَعْدٍ قَالَ: رَأَى سَعْدُ بْنُ أَبِي وَقَّاصٍ ﷺ أَنَّ لَهُ فَضْلاً عَلَى مَنْ دُونَهُ، فَقَالَ النَّبِيُّ ﷺ: «هَلْ تُنْصَرُونَ وَتُرْزَقُونَ إِلاَّ بِضُعَفَائِكُمْ». [رواه البخاري: ٢٨٩٦]

**1249.** Rəvayət edilir ki, Musab ibn Səd demişdir: "Səd ibn Əbu Vəqqas (cəsur, həm də dövlətli olduğundan) özünün başqalarından üstün olduğunu güman edirdi. Onda Peyğəmbər ﷺ dedi: "Məgər sizə aranızdakı zəiflərin (duaları sayəsində) zəfər və ruzi bəxş edilmirmi?!" (əl-Buxari, 2896)

١٢٥٠ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «يَأْتِي زَمَانٌ يَغْزُو فِئَامٌ مِنَ النَّاسِ، فَيُقَالُ فِيكُمْ مَنْ صَحِبَ النَّبِيَّ ﷺ فَيُقَالُ نَعَمْ. فَيُفْتَحُ عَلَيْهِ، ثُمَّ يَأْتِي زَمَانٌ فَيُقَالُ فِيكُمْ مَنْ صَحِبَ أَصْحَابَ النَّبِيِّ ﷺ فَيُقَالُ نَعَمْ.

---
[1] "Ali-İmran" surəsi, 200.

فَيُفْتَحُ، ثُمَّ يَأْتِي زَمَانٌ فَيُقَالُ فِيكُمْ مَنْ صَحِبَ صَاحِبَ أَصْحَابِ النَّبِيِّ ﷺ فَيُقَالُ نَعَمْ. فَيُفْتَحُ». [رواه البخاري: ٢٨٩٧]

**1250.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Elə bir zaman gələcək ki, bir dəstə adam döyüşə çıxacaq, (döyüşçülərdən): "Aranızda Peyğəmbərin ﷺ əshabəsi olmuş bir kimsə varmı?"– deyə soruşulduqda onlar: "Bəli!"– deyə cavab verəcəklər. Məhz onun sayəsində (onlara) zəfər bəxş ediləcək. Sonra elə bir zaman gələcək ki: "Aranızda Peyğəmbərin ﷺ əshabəsini görmüş bir kimsə varmı?"– deyə soruşulduqda: "Bəli!"– deyə cavab veriləcək və (beləliklə də, onlara) zəfər bəxş ediləcək. Bundan sonra elə bir zaman gələcək ki: "Aranızda Peyğəmbərin ﷺ əshabəsinin əshabəsini görmüş bir kimsə varmı?"– deyə soruşulduqda: "Bəli!"– deyə cavab veriləcək və (beləliklə də, onlara) zəfər bəxş ediləcək." (əl-Buxari, 2897)

## 38-ci fəsil. Ox atmağa təşviq etmək

## ٣٨– باب: التَّحْرِيضُ عَلَى الرَّمْيِ

**١٢٥١** – عَنْ أَبِي أُسَيْدٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ يَوْمَ بَدْرٍ حِينَ صَفَفْنَا لِقُرَيْشٍ وَصَفُّوا لَنَا: «إِذَا أَكْثَبُوكُمْ فَعَلَيْكُمْ بِالنَّبْلِ». [رواه البخاري: ٢٩٠٠]

**1251.** Rəvayət edilir ki, Əbu Useyd ﷺ demişdir: "Bədr döyüşündə biz qureyşlilərə qarşı, qureyşlilər də bizə qarşı durub cərgələrə düzüldükdə Peyğəmbər ﷺ buyurdu: "(Müşriklər) sizə yaxınlaşdıqları zaman onları ox atəşinə tutun!" (əl-Buxari, 2900)

## 39-cu fəsil. Qalxandan istifadə etmək və (döyüşdə) dostunun qalxanı ilə müdafiə olunan kimsə haqqında

## ٣٩– باب: الْمِجَنُّ وَمَنْ يَتَتَرَّسُ بِتُرْسِ صَاحِبِهِ

**١٢٥٢** – عَنْ عُمَرَ ﷺ قَالَ: كَانَتْ أَمْوَالُ بَنِي النَّضِيرِ مِمَّا أَفَاءَ اللَّهُ عَلَى رَسُولِهِ ﷺ مِمَّا لَمْ يُوجِفِ الْمُسْلِمُونَ عَلَيْهِ بِخَيْلٍ وَلاَ رِكَابٍ، فَكَانَتْ لِرَسُولِ اللَّهِ ﷺ خَاصَّةً، وَكَانَ يُنْفِقُ عَلَى أَهْلِهِ نَفَقَةَ سَنَتِهِ، ثُمَّ يَجْعَلُ مَا بَقِيَ فِي السِّلاَحِ وَالْكُرَاعِ، عُدَّةً فِي سَبِيلِ اللَّهِ. [رواه البخاري: ٢٩٠٤]

**1252.** Rəvayət edilir ki, Ömər ﷺ demişdir: "Allah Bəni-Nədir qəbiləsinin var-yoxunu qənimət olaraq Öz elçisinə ﷺ verdi, müsəlmanlar bu qənimətləri əldə etmək üçün (döyüş meydanına) nə bir at, nə də bir dəvə sürdülər. Bu (qənimətlər) Allahın elçisinə məxsus idi. O, (bundan) öz ailəsinin bir illik azuqəsini ayırdıqdan sonra yerdə qalanını Allah yolunda (cihada) hazırlıq məqsədilə silah və at almağa xərcləyərdi." (əl-Buxari, 2904)

**١٢٥٣** – عَنْ عَلِيٍّ ﷺ قَالَ: مَا رَأَيْتُ النَّبِيَّ ﷺ يُفَدِّي رَجُلاً بَعْدَ سَعْدٍ، سَمِعْتُهُ يَقُولُ: «ارْمِ فِدَاكَ أَبِي وَأُمِّي». [رواه البخاري: ٢٩٠٥]

**1253.** Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ Səddən başqa heç kəsə: "Atam-anam sənə fəda olsun!"– dediyini eşitməmişəm. Mən onun (Səd ibn Əbu Vəqqasa) belə dediyini eştmişəm: "Oxla vur (onları), atam-anam sənə fəda olsun!" (əl-Buxari, 2905)

## ٤٠– باب: مَا جَاءَ فِي حِلْيَةِ السُّيُوفِ

## 40-cı fəsil. Qılıncın bəzədilməsi haqqında deyilənlər

**١٢٥٤ –** عَنْ أَبِي أُمَامَةَ ﷺ قَالَ: لَقَدْ فَتَحَ الْفُتُوحَ قَوْمٌ مَا كَانَتْ حِلْيَةُ سُيُوفِهِمِ الذَّهَبَ وَلاَ الْفِضَّةَ، إِنَّمَا كَانَتْ حِلْيَتُهُمُ الْعَلاَبِيَّ وَالآنُكَ وَالْحَدِيدَ. [رواه البخاري: ٢٩٠٩]

**1254.** Rəvayət edilir ki, Əbu Umamə ﷺ demişdir: "Neçə-neçə ölkələri fəth etmiş bir çox insanlar olmuşdur ki, onların qılıncları nə qızılla, nə də gümüşlə bəzədilərdi; onların qılınclarının bəzəyi ancaq aşılanmamış dəridən, qurğuşundan və dəmirdən ibarət idi." (əl-Buxari, 2909)

## ٤١– باب: مَا قِيلَ فِى دِرْعِ النَّبِيِّ ﷺ وَالْقَمِيصُ فِى الْحَرْبِ

## 41-ci fəsil. Peyğəmbərin ﷺ zirehi haqqında deyilənlər və döyüşdə zireh geyinmək haqqında

**١٢٥٥ –** عَنْ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ وَهُوَ فِى قُبَّةٍ: «اللَّهُمَّ إِنِّى أَنْشُدُكَ عَهْدَكَ وَوَعْدَكَ، اللَّهُمَّ إِنْ شِئْتَ لَمْ تُعْبَدْ بَعْدَ الْيَوْمِ». فَأَخَذَ أَبُو بَكْرٍ بِيَدِهِ فَقَالَ حَسْبُكَ يَا رَسُولَ اللَّهِ، فَقَدْ أَلْحَحْتَ عَلَى رَبِّكَ، وَهُوَ فِى الدِّرْعِ، فَخَرَجَ وَهُوَ يَقُولُ: ﴿ سَيُهْزَمُ ٱلْجَمْعُ وَيُوَلُّونَ ٱلدُّبُرَ ﴿٤٥﴾ بَلِ ٱلسَّاعَةُ مَوْعِدُهُمْ وَٱلسَّاعَةُ أَدْهَىٰ وَأَمَرُّ ﴿٤٦﴾ ﴾
وَ فِي رِوَايَةٍ: يَوْمَ بَدْرٍ. [رواه البخاري: ٢٩١٥]

**1255.** İbn Abbas ﷺ rəvayət edir ki, Bədr döyüşündən bir az əvvəl Peyğəmbər ﷺ çadırda ikən (dua edib) dedi: "Allahım, Səndən (kafirlərə qalib gələcəyimizə dair) verdiyin sözü və vədi gerçəkləşdirməyi diləyirəm! Allahım, əgər Sən (möminlərin həlak olmağını) istəsən, bu gündən sonra artıq Sənə ibadət edən qalmayacaq!" Bu vaxt Əbu Bəkr Peyğəmbərin ﷺ əlindən tutub dedi: "Yetər, ya Rəsulullah! Sən artıq Rəbbinə təkidlə dua etdin!" Sonra Peyğəmbər ﷺ əynində zireh bayıra çıxdı və (bu ayələri) oxudu: "Bu dəstə mütləq məğlub olacaq və arxaya dönüb qaçacaqdır. Xeyr! Onlara vəd edilmiş vaxt o saatdır. O saat isə daha ağır, daha acıdır." (əl-Buxari, 2915)

## ٤٢– باب: الْحَرِيرُ فِى الْحَرْبِ

## 42-ci fəsil. Döyüşdə ipək paltar geyinmək

**١٢٥٦ –** عَنْ أَنَسٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ رَخَّصَ لِعَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ وَالزُّبَيْرِ فِى قَمِيصٍ مِنْ حَرِيرٍ، مِنْ حِكَّةٍ كَانَتْ بِهِمَا. [رواه البخاري: ٢٩١٩]

**1256.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Abdur-Rəhman ibn Auf və Zubeyr ibn Əvvamın bədəninə gicişmə düşdüyündən Peyğəmbər ﷺ onlara ipək köynək geyinməyə rüsxət vermişdir.” (əl-Buxari, 2919)

**١٢٥٧** – عَنْ أَنَسٍ ﷺ أَنَّ عَبْدَ الرَّحْمَنِ بْنَ عَوْفٍ وَالزُّبَيْرَ شَكَوَا إِلَى النَّبِىِّ ﷺ – يَعْنِى الْقَمْلَ – فَأَرْخَصَ لَهُمَا فِى الْحَرِيرِ. [رواه البخاري: ٢٩٢٠]

**1257.** Ənəs ﷺ rəvayət etmişdir ki, Abdur-Rəhman ibn Auf və Zubeyr ibn Əvvam bədənlərinə bit düşdüyündən Peyğəmbərə ﷺ şikayət etdikdə Peyğəmbər ﷺ onlara ipək köynək geyinməyə rüsxət vermişdir.” (əl-Buxari, 2920)

## 43-cü fəsil. Rumlulara qarşı vuruşmaq haqqında deyilənlər

## ٤٣– باب: مَا قِيلَ فِى قِتَالِ الرُّومِ

**١٢٥٨** – عَنْ أُمِّ حَرَامٍ ﷺ أَنَّهَا سَمِعَتِ النَّبِىَّ ﷺ يَقُولُ: «أَوَّلُ جَيْشٍ مِنْ أُمَّتِى يَغْزُونَ الْبَحْرَ قَدْ أَوْجَبُوا». قَالَتْ أُمُّ حَرَامٍ قُلْتُ يَا رَسُولَ اللَّهِ أَنَا فِيهِمْ. قَالَ: «أَنْتِ فِيهِمْ». ثُمَّ قَالَ النَّبِىُّ ﷺ: «أَوَّلُ جَيْشٍ مِنْ أُمَّتِى يَغْزُونَ مَدِينَةَ قَيْصَرَ مَغْفُورٌ لَهُمْ». فَقُلْتُ أَنَا فِيهِمْ يَا رَسُولَ اللَّهِ. قَالَ: «لاَ». [رواه البخاري: ٢٩٣٤]

**1258.** Rəvayət edilir ki, Ummu Həram ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: “Ümmətimdən ilk dəniz döyüşünə çıxan orduya (Cənnətə girmək) vacib olacaq!” Ummu Həram dedi: “Mən soruşdum: “Ya Rəsulullah, mən onların arasında olacağammı?” Peyğəmbər ﷺ buyurdu: “Sən onların arasında olacaqsan.” Sonra Peyğəmbər ﷺ dedi: “Ümmətimdən Qeysərin şəhərinə[1] yürüş edən ilk ordunun (günahları) bağışlanacaq!” Mən soruşdum: “Ya Rəsulullah, mən onların arasında olacağammı?” Peyğəmbər ﷺ: “Xeyr!”- dedi. (əl-Buxari, 2934)

## 44-cü fəsil. Yəhudilərlə döyüşmək haqqında

## ٤٤– باب: قِتَالُ الْيَهُودِ

**١٢٥٩** – (أ)– عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «تُقَاتِلُونَ الْيَهُودَ حَتَّى يَخْتَبِىَ أَحَدُهُمْ وَرَاءَ الْحَجَرِ فَيَقُولُ يَا عَبْدَ اللَّهِ هَذَا يَهُودِىٌّ وَرَائِى فَاقْتُلْهُ». [رواه البخاري: ٢٩٢٥]

**1259.** (a) – Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “(Vaxt gələcək) siz yəhudilərlə vuruşacaqsınız;[2] hətta onlardan bəziləri daşın arxasında gizlənəcək və daş dilə gəlib deyəcək: “Ey Allahın qulu, arxamda gizlənən bu (adam) yəhudidir. Durma, öldür onu!” (əl-Buxari, 2925)

---

[1] Burada Qeysərin şəhəri deyildikdə Rum imperiyasının paytaxtı Konstantinopol (indiki İstanbul) nəzərdə tutulur.

[2] Burada Qiyamət gününə yaxın müsəlmanlarla yəhudilər arasında olan döyüş nəzərdə tutulur.

١٢٥٩ – (ب)- عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: «لاَ تَقُومُ السَّاعَةُ حَتَّى تُقَاتِلُوا الْيَهُودَ حَتَّى يَقُولَ الْحَجَرُ وَرَاءَهُ الْيَهُودِىُّ يَا مُسْلِمُ، هَذَا يَهُودِىٌّ وَرَائِى فَاقْتُلْهُ». [رواه البخاري: ٢٩٢٦]

**1259.** (b) – Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Siz yəhudilərlə vuruşmayınca Qiyamət qopmayacaq. Hətta daş, arxasında gizlənmiş yəhudini göstərib deyəcək: "Ey müsəlman, arxamda yəhudi var! Durma, öldür onu!" (əl-Buxari, 2926)

## 45-ci fəsil. Türklərlə döyüşmək haqqında

## ٤٥ – باب: قِتَالُ التُّرْكِ

١٢٦٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لاَ تَقُومُ السَّاعَةُ حَتَّى تُقَاتِلُوا التُّرْكَ صِغَارَ الأَعْيُنِ، حُمْرَ الْوُجُوهِ، ذُلْفَ الأُنُوفِ، كَأَنَّ وُجُوهَهُمُ الْمَجَانُّ الْمُطَرَّقَةُ، وَلاَ تَقُومُ السَّاعَةُ حَتَّى تُقَاتِلُوا قَوْمًا نِعَالُهُمُ الشَّعَرُ». [رواه البخاري: ٢٩٢٨]

**1260.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Siz qıyıq gözlü, qırmızı sifət, yastı burun, üzləri də döymə qalxana bənzər türklərlə vuruşmayınca Qiyamət qopmayacaq. Həmçinin qıldan qayrılmış səndəllər geyinmiş adamlarla vuruşmayınca Qiyamət qopmayacaq." (əl-Buxari, 2928)

## 46-cı fəsil. Müşriklərin məğlub olması və sarsılması üçün bəddua etmək

## ٤٦ – باب: الدُّعَاءُ عَلَى الْمُشْرِكِينَ بِالْهَزِيمَةِ وَالزَّلْزَلَةِ

١٢٦١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِى أَوْفَى ﷺ قَالَ: دَعَا رَسُولُ اللَّهِ ﷺ يَوْمَ الأَحْزَابِ عَلَى الْمُشْرِكِينَ فَقَالَ: «اللَّهُمَّ مُنْزِلَ الْكِتَابِ سَرِيعَ الْحِسَابِ، اللَّهُمَّ اهْزِمِ الأَحْزَابَ، اللَّهُمَّ اهْزِمْهُمْ وَزَلْزِلْهُمْ». [رواه البخاري: ٢٩٣٣]

**1261.** Rəvayət edilir ki, Abdullah ibn Əbu Əufə ﷺ demişdir: "Peyğəmbər ﷺ Xəndək döyüşündə müşriklərin əleyhinə dua edib dedi: "Kitabı nazil edən, haqq-hesabı tez çəkən Allahım! Allahım! (Düşmənlərdən olan) dəstələri darmadağın et! Allahım, onları yerlə yeksan et və onları sarsıt![1]" (əl-Buxari, 2933)

١٢٦٢ – عَنْ عَائِشَةَ ﷺ أَنَّ الْيَهُودَ دَخَلُوا عَلَى النَّبِىِّ ﷺ فَقَالُوا السَّامُ عَلَيْكَ. فَلَعَنْتُهُمْ. فَقَالَ: «مَا لَكِ؟» قُلْتُ أَوَلَمْ تَسْمَعْ مَا قَالُوا؟ قَالَ: «فَلَمْ تَسْمَعِى مَا قُلْتُ وَعَلَيْكُمْ». [رواه البخاري: ٢٩٣٥]

**1262.** Aişə ﷺ rəvayət edir ki, yəhudilərdən (bəziləri) Peyğəmbərin ﷺ yanına gəlib (ona): "Əssamu aleykə (sənə ölüm olsun)!"– dedilər. Mən də onlara lənət oxudum. Peyğəmbər ﷺ: "Sənə nə olub?"– dedi. Dedim: "Məgər sən onların nə dediyini eşitmədinmi?" O dedi: "Bəs sən mənim onlara: "və aleykum (sizə olsun)!"– dediyimi eşitmədinmi?" (əl-Buxari, 2935)

---

[1] Transkripsiyası: Allahummə munziləl-kitabi, səriəl-hisabi, Allahumməhzimil-əhzabə, Allahumməhzimhum və zəlzilhum.

**47-ci fəsil.** (Qəlbləri müsəlmanlığa) **isinişib bağlansın deyə müşriklərin doğru yola gəlməsi üçün** (Allaha) **dua etmək**

**٤٧- باب:**
**الدُّعَاءُ لِلْمُشْرِكِينَ بِالْهُدَى لِيَتَأَلَّفَهُمْ**

١٢٦٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَدِمَ طُفَيْلُ بْنُ عَمْرٍو الدَّوْسِيُّ وَأَصْحَابُهُ عَلَى النَّبِيِّ ﷺ فَقَالُوا يَا رَسُولَ اللَّهِ، إِنَّ دَوْسًا عَصَتْ وَأَبَتْ، فَادْعُ اللَّهَ عَلَيْهَا. فَقِيلَ هَلَكَتْ دَوْسٌ. قَالَ: «اللَّهُمَّ اهْدِ دَوْسًا وَائْتِ بِهِمْ». [رواه البخاري: ٢٩٣٧]

**1263.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Tufeyl ibn Amr əd-Dövsi öz tərəfdarları ilə birlikdə Peyğəmbərin ﷺ yanına gəlib dedilər: "Ey Allahın elçisi! Dövs qəbiləsi asi oldular və (müsəlmançılıqdan) imtina etdilər. Onlara bəddua et!" (Oradakılar bunu eşitdikdə) dedilər: "Dövs həlak oldu!" Lakin Peyğəmbər ﷺ dua edib dedi: "Allahım, dövsliləri doğru yola yönəlt və onları (İslam dininə) gətir!" (əl-Buxari, 2937)

**48-ci fəsil. Peyğəmbərin ﷺ insanları İslam dininə və onun peyğəmbərliyini qəbul etməyə, habelə Allahı qoyub bir-birilərini ilahiləşdirməməyə çağırması**

**٤٨- باب:**
**دُعَاءُ النَّبِيِّ ﷺ إِلَى الإِسْلاَمِ وَالنُّبُوَّةِ، وَأَنْ لاَ يَتَّخِذَ بَعْضُهُمْ بَعْضًا أَرْبَابًا مِنْ دُونِ اللَّهِ**

١٢٦٤ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ يَوْمَ خَيْبَرَ: «لأُعْطِيَنَّ الرَّايَةَ رَجُلاً يَفْتَحُ اللَّهُ عَلَى يَدَيْهِ». فَقَامُوا يَرْجُونَ لِذَلِكَ أَيُّهُمْ يُعْطَى، فَغَدَوْا وَكُلُّهُمْ يَرْجُو أَنْ يُعْطَى فَقَالَ: «أَيْنَ عَلِيٌّ؟» فَقِيلَ يَشْتَكِي عَيْنَيْهِ، فَأَمَرَ فَدُعِيَ لَهُ، فَبَصَقَ فِي عَيْنَيْهِ، فَبَرَأَ مَكَانَهُ حَتَّى كَأَنَّهُ لَمْ يَكُنْ بِهِ شَيْءٌ فَقَالَ نُقَاتِلُهُمْ حَتَّى يَكُونُوا مِثْلَنَا. فَقَالَ: «عَلَى رِسْلِكَ حَتَّى تَنْزِلَ بِسَاحَتِهِمْ، ثُمَّ ادْعُهُمْ إِلَى الإِسْلاَمِ، وَأَخْبِرْهُمْ بِمَا يَجِبُ عَلَيْهِمْ، فَوَاللَّهِ لأَنْ يُهْدَى بِكَ رَجُلٌ وَاحِدٌ خَيْرٌ لَكَ مِنْ حُمْرِ النَّعَمِ». [رواه البخاري: ٢٩٤٢]

**1264.** Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ Peyğəmbərin ﷺ Xeybər döyüşündə belə dediyini eşitmişdir: "Mən bu bayrağı elə bir adama verəcəyəm ki, Allah onun əli ilə (müsəlmanlara) qələbə bəxş edəcək." Əshabələrdən hər biri bayrağın ona veriləcəyinə ümid edərək qalxıb getdi. Səhəri gün (Peyğəmbərin ﷺ yanına) gəldikdə onlardan hər biri bayrağın ona veriləcəyinə ümid edirdi. Amma Peyğəmbər ﷺ: "Əli haradadır?"– deyə soruşdu. Ona dedilər ki, Əlinin gözləri ağrıyır. Onda Peyğəmbər ﷺ onun çağırılmasını əmr etdi. Peyğəmbər ﷺ Əlinin gözlərinə yüngülcə tüpürdü və onun gözləri sağaldı, elə bil heç ağrımırdı. Sonra Əli dedi: "(Xeybərlilər) bizim kimi (müsəlman) olanadək onlarla vuruşacağıq." Peyğəmbər ﷺ buyurdu: "Onların yurduna gedib çatanadək tələsmə. Sonra onları İslama dəvət et və özlərinə vacib buyrulanı onlara bildir. Vallahi, əgər Allah sənin vasitənlə bir nəfəri doğru yola yönəltsə, bu sənin üçün qırmızı dəvələrdən daha xeyirli olar." (əl-Buxari, 2942)

## 49-cu fəsil. Bir yerə döyüşə çıxmaq istəyən kimsənin başqa bir yerə gedəcəyini elan etməsi, habelə cümə axşamı səfərə çıxan kimsə haqqında

## ٤٩- باب: مَنْ أَرَادَ غَزْوَةً فَوَرَّى بِغَيْرِهَا، وَمَنْ أَحَبَّ الْخُرُوجَ يَوْمَ الْخَمِيسِ

١٢٦٥ - عَنْ كَعْبِ بْنِ مَالِكٍ ﷺ قَالَ: لَقَلَّمَا كَانَ رَسُولُ اللَّهِ ﷺ يَخْرُجُ إِذَا خَرَجَ فِى سَفَرٍ إِلاَّ يَوْمَ الْخَمِيسِ. [رواه البخاري: ٢٩٤٩]

**1265.** Rəvayət edilir ki, Kəb ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ bir yerə səfərə çıxmaq istədikdə çox nadir hallarda cümə axşamından başqa günlərdə səfərə çıxardı." (əl-Buxari, 2949)

## 50-ci fəsil. Vidalaşmaq

## ٥٠- باب: التَّوْدِيعُ

١٢٦٦ - عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّهُ قَالَ: بَعَثَنَا رَسُولُ اللَّهِ ﷺ فِى بَعْثٍ، وَقَالَ لَنَا: «إِنْ لَقِيتُمْ فُلاَنًا وَفُلاَنًا» - لِرَجُلَيْنِ مِنْ قُرَيْشٍ سَمَّاهُمَا - فَحَرِّقُوهُمَا بِالنَّارِ. قَالَ ثُمَّ أَتَيْنَاهُ نُوَدِّعُهُ حِينَ أَرَدْنَا الْخُرُوجَ فَقَالَ: «إِنِّى كُنْتُ أَمَرْتُكُمْ أَنْ تُحَرِّقُوا فُلاَنًا وَفُلاَنًا بِالنَّارِ، وَإِنَّ النَّارَ لاَ يُعَذِّبُ بِهَا إِلاَّ اللَّهُ، فَإِنْ أَخَذْتُمُوهُمَا فَاقْتُلُوهُمَا». [رواه البخاري: ٢٩٥٤]

**1266.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bizi bir yerə göndərdi və dedi: "Əgər filankəsə və filankəsə – qureyşdən olan iki nəfərin adını çəkdi – rast gəlsəniz, onları yandırın. Sonra biz səfərə çıxmaq istədikdə, Peyğəmbərlə ﷺ vidalaşmaq üçün onun yanına gəldik və o, bizə dedi: "Hərçənd, mən sizə filankəsi və filankəsi yandırmağı əmr etmişdim, lakin (biləsiniz ki,) odla yalnız Allah əzab verir. Odur ki, onları tutsanız, öldürün!" (əl-Buxari, 2954)

## 51-ci fəsil. Əmr sahibini eşitmək və ona itaət etmək

## ٥١- باب: السَّمْعُ وَالطَّاعَةُ لِلإِمَامِ

١٢٦٧ - عَنِ ابْنِ عُمَرَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «السَّمْعُ وَالطَّاعَةُ حَقٌّ، مَا لَمْ يُؤْمَرْ بِالْمَعْصِيَةِ، فَإِذَا أُمِرَ بِمَعْصِيَةٍ فَلاَ سَمْعَ وَلاَ طَاعَةَ». [رواه البخاري: ٢٩٥٥]

**1267.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Asilik (etmək[1]) əmr olunmayınca eşitmək və itaət etmək[2] vacibdir. Asilik (etmək) əmr olunduqda isə, nə eşitmək, nə də itaət etmək olar." (əl-Buxari, 2955)

## 52-ci fəsil. Əmr sahibinin arxasında vuruşmaq və onu mühafizə etmək

## ٥٢- باب: يُقَاتَلُ مِنْ وَرَاءِ الإِمَامِ وَيُتَّقَى بِهِ

١٢٦٨ - عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «نَحْنُ الآخِرُونَ السَّابِقُونَ» وَ يَقُولُ: «مَنْ أَطَاعَنِى فَقَدْ أَطَاعَ اللَّهَ، وَمَنْ عَصَانِى فَقَدْ عَصَى اللَّهَ، وَمَنْ يُطِعِ الأَمِيرَ فَقَدْ أَطَاعَنِى، وَمَنْ يَعْصِ الأَمِيرَ فَقَدْ عَصَانِى، وَإِنَّمَا

---

[1] Burada Allaha və Onun peyğəmbərinə ﷺ qarşı olan asilik nəzərdə tutulur.
[2] Söhbət ixtiyar sahiblərindən gedir.

الإِمَامُ جُنَّةٌ يُقَاتَلُ مِنْ وَرَائِهِ وَيُتَّقَى بِهِ، فَإِنْ أَمَرَ بِتَقْوَى اللَّهِ وَعَدَلَ، فَإِنَّ لَهُ بِذَلِكَ أَجْرًا، وَإِنْ قَالَ بِغَيْرِهِ، فَإِنَّ عَلَيْهِ مِنْهُ». [رواه البخاري: ٢٩٥٧]

**1268.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Biz sonuncular birincilər olacağıq.[1]" (Peyğəmbər ﷺ həmçinin) demişdir: "Kim mənə itaət etsə, Allaha itaət etmiş olar, kim mənə asi olsa, Allaha asi olmuş olar. Eləcə də kim əmirə itaət etsə, mənə itaət etmiş olar, kim əmirə asi olsa, mənə asi olmuş olar. Əmir, həqiqətən, bir qalxandır. Onun rəhbərliyi altında vuruşulur və onun sayəsində (düşməndən) qorunmaq olur. Əgər o (öz rəiyyətinə) Allahdan qorxmağı[2] əmr edərsə, özü də ədalətli olarsa, buna görə savab qazanar. Yox, əgər başqa şeylər[3] əmr edərsə, günahı onun öz boynunda qalar." (əl-Buxari, 2957)

## 53-cü fəsil. Döyüşdə düşməndən qaçmamağa dair beyət etmək

## ٥٣ – باب: الْبَيْعَةُ فِي الْحَرْبِ أَنْ لاَ يَفِرُّوا

١٢٦٩ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: رَجَعْنَا مِنَ الْعَامِ الْمُقْبِلِ فَمَا اجْتَمَعَ مِنَّا اثْنَانِ عَلَى الشَّجَرَةِ الَّتِي بَايَعْنَا تَحْتَهَا، كَانَتْ رَحْمَةً مِنَ اللَّهِ قِيْلَ لَهُ: عَلَى أَيِّ شَيْءٍ بَايَعَهُمْ، عَلَى الْمَوْتِ؟ قَالَ: لاَ، بَايَعَهُمْ عَلَى الصَّبْرِ. [رواه البخاري: ٢٩٥٨]

**1269.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Növbəti il[4] biz (Hudeybiyəyə) qayıtdıqda aramızdan iki nəfər tapılmadı ki, altında beyət etdiyimiz ağacın (hansı ağac olduğunu) göstərsin. Bu, Allahdan bir mərhəmət idi.[5]"

İbn Ömərdən soruşdular: "Peyğəmbər ﷺ əshabələrinə (bu yolda) öləcəklərinəmi beyət etdirmişdi?" Dedi: "Xeyr, səbir edəcəklərinə beyət etdirmişdi." (əl-Buxari, 2958)

١٢٧٠ – عَنْ عَبْدِ اللَّهِ بْنِ زَيْدٍ رضي الله عنه قَالَ لَمَّا كَانَ زَمَنَ الْحَرَّةِ أَتَاهُ آتٍ فَقَالَ لَهُ إِنَّ ابْنَ حَنْظَلَةَ يُبَايِعُ النَّاسَ عَلَى الْمَوْتِ. فَقَالَ: لاَ أُبَايِعُ عَلَى هَذَا أَحَدًا بَعْدَ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٢٩٥٩]

**1270.** Abdullah ibn Zeyd ﷺ rəvayət etmişdir ki, hərra zamanı[6] bir nəfər onun yanına gəlib dedi: "Hənzələnin oğlu camaata ölənədək vuruşmağa dair beyət etdirir." Abdullah dedi: "Mən bu xüsusda Peyğəmbərdən ﷺ sonra heç kəsə beyət edən deyiləm." (əl-Buxari, 2959)

---

[1] 492-ci hədisə və onun qeydlərinə bax.
[2] Yəni yaxşı işlər görməyi.
[3] Yəni günah işlər görməyi.
[4] Yəni Hudeybiyədə sülh bağladıqları ildən sonra gələn il.
[5] Yoxsa bəziləri həmin ağacı müqəddəs bir şey hesab edərdilər.
[6] Hərra Mədinənin yaxınlığında yerləşən bir yerdir. 173-cü və 903-cü hədislərə və onların qeydlərinə bax. Bu hədisdə isə burada baş vermiş hadisə qəsd edilir. Belə ki, milad tarixilə 683-cü ildə Mədinə əhli üsyan edib Yezidin ordusuna qarşı vuruşmuşlar.

١٢٧١ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ قَالَ: بَايَعْتُ النَّبِيَّ ﷺ ثُمَّ عَدَلْتُ إِلَى ظِلِّ الشَّجَرَةِ، فَلَمَّا خَفَّ النَّاسُ قَالَ: «يَا ابْنَ الأَكْوَعِ، أَلاَ تُبَايِعُ». قَالَ قُلْتُ قَدْ بَايَعْتُ يَا رَسُولَ اللَّهِ. قَالَ: «وَأَيْضًا». فَبَايَعْتُهُ الثَّانِيَةَ، فَقُلْتُ لَهُ يَا أَبَا مُسْلِمٍ، عَلَى أَيِّ شَيْءٍ كُنْتُمْ تُبَايِعُونَ يَوْمَئِذٍ قَالَ عَلَى الْمَوْتِ. [رواه البخاري: ٢٩٦٠]

**1271.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ﷺ demişdir: "Mən (Hudeybiyədə) Peyğəmbərə ﷺ beyət etdikdən sonra ağacın kölgəsinə çəkildim. (Beyət edən) adamların sayı azaldıqda Peyğəmbər ﷺ (məni çağırıb) dedi: "Ey Əkvanın oğlu, beyət etmək istəmirsənmi?" Dedim: "Mən beyət etdim, ya Rəsulullah." Peyğəmbər ﷺ: "Yenə (beyət et)!"– dedi. Mən də ikinci dəfə beyət etdim.

(Yezid ibn Əbu Ubeyd demişdir): "Mən (Sələmə ibn Əkvadan) soruşdum: "Ey Əbu Muslim, həmin gün siz nəyə beyət edirdiniz?" O dedi: "Ölməyə!" (əl-Buxari, 2960)

١٢٧٢ – عَنْ مُجَاشِعٍ ﷺ قَالَ: أَتَيْتُ النَّبِيَّ ﷺ أَنَا وَأَخِي فَقُلْتُ بَايِعْنَا عَلَى الْهِجْرَةِ. فَقَالَ: «مَضَتِ الْهِجْرَةُ لأَهْلِهَا». فَقُلْتُ عَلاَمَ تُبَايِعُنَا؟ قَالَ: «عَلَى الإِسْلاَمِ وَالْجِهَادِ». [رواه البخاري: ٢٩٦٢–٢٩٦٣]

**1272.** Rəvayət edilir ki, Mucaşi ﷺ demişdir: "Mən qardaşımla birlikdə Peyğəmbərin ﷺ yanına gəlib dedim: "Hicrət edəcəyimizə beyət edirik." Peyğəmbər ﷺ buyurdu: "Artıq hicrət bitmişdir!" Mən soruşdum: "Elə isə biz nəyə beyət edək?" Dedi: "(Ölənədək) İslamı (yaşadacağınıza) və cihad (edəcəyinizə)!" (əl-Buxari, 2962-2963)

## 54-cü fəsil. Əmir sahibi camaatdan ancaq onların gücü çatdığı bir işi tələb edə bilər

## ٥٤– باب: عَزْمُ الإِمَامِ عَلَى النَّاسِ فِيمَا يُطِيقُونَ

١٢٧٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: لَقَدْ أَتَانِي الْيَوْمَ رَجُلٌ فَسَأَلَنِي عَنْ أَمْرٍ مَا دَرَيْتُ مَا أَرُدُّ عَلَيْهِ، فَقَالَ أَرَأَيْتَ رَجُلاً مُؤْدِيًا نَشِيطًا، يَخْرُجُ مَعَ أُمَرَائِنَا فِي الْمَغَازِي، فَيَعْزِمُ عَلَيْنَا فِي أَشْيَاءَ لاَ نُحْصِيهَا. فَقُلْتُ لَهُ وَاللَّهِ مَا أَدْرِي مَا أَقُولُ لَكَ إِلاَّ أَنَّا كُنَّا مَعَ النَّبِيِّ ﷺ فَعَسَى أَنْ لاَ يَعْزِمَ عَلَيْنَا فِي أَمْرٍ إِلاَّ مَرَّةً حَتَّى نَفْعَلَهُ، وَإِنَّ أَحَدَكُمْ لَنْ يَزَالَ بِخَيْرٍ مَا اتَّقَى اللَّهَ، وَإِذَا شَكَّ فِي نَفْسِهِ شَيْءٌ سَأَلَ رَجُلاً فَشَفَاهُ مِنْهُ، وَأَوْشَكَ أَنْ لاَ تَجِدُوهُ، وَالَّذِي لاَ إِلَهَ إِلاَّ هُوَ مَا أَذْكُرُ مَا غَبَرَ مِنَ الدُّنْيَا إِلاَّ كَالثَّغْبِ شُرِبَ صَفْوُهُ وَبَقِيَ كَدَرُهُ. [رواه البخاري: ٢٩٦٤]

**1273.** Rəvayət edilir ki, (bir dəfə) Abdullah ibn Məsud ﷺ dedi: "Bir gün bir nəfər mənim yanıma gəldi və məndən cavabını bilmədiyim bir şey haqqında soruşub dedi: "De görüm, yaxşı hazırlıq keçmiş və çox qətiyyətli bir adam əmirlərimizlə birlikdə döyüşə çıxarsa və orada bizə gücümüz yetmədiyi bir işi tapşırarsa, (biz ona itaət etməliyikmi)?" Mən dedim: "Vallahi, mən bilmirəm sənə nə deyim. Ancaq (onu deyə bilərəm ki,) biz Peyğəmbərlə ﷺ birgə (döyüşdə olanda) o, bir işi bizə bir dəfə əmr edər, biz də onu dərhal yerinə yetirərdik. Siz Allahdan qorxduqca xeyir içində olacaqsınız. Qəlbinizə şübhə düşsə, (bu haqda şəriəti yaxşı bilən) bir adamdan soruşun ki, o, (şübhəni) sizdən uzaq etsin. Lakin (elə bir dövran) ola bilər ki, siz belə adamlar tapa bilməyəsiniz. Özündən başqa məbud olmayan Allaha and olsun ki, mən bu dünyada olub-keçən işlər barədə düşündükdə (mən bunu) təmiz suyu içilmiş və yerində çöküntüsü qalmış bir nohura bənzədirəm." (əl-Buxari, 2964)

## 55-ci fəsil. Peyğəmbər ﷺ günün əvvəlində döyüşə başlamadıqda onu gün batmağa meyil edənədək yubadardı

## ٥٥- باب: كَانَ النَّبِىُّ ﷺ إِذَا لَمْ يُقَاتِلْ أَوَّلَ النَّهَارِ أَخَّرَ الْقِتَالَ حَتَّى تَزُولَ الشَّمْسُ

١٢٧٤ - عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِى أَوْفَى رضي الله عنه، أَنَّ رَسُولَ اللَّهِ ﷺ فِى بَعْضِ أَيَّامِهِ الَّتِى لَقِىَ فِيهَا انْتَظَرَ حَتَّى مَالَتِ الشَّمْسُ، ثُمَّ قَامَ فِى النَّاسِ قَالَ: «أَيُّهَا النَّاسُ، لاَ تَتَمَنَّوْا لِقَاءَ الْعَدُوِّ، وَسَلُوا اللَّهَ الْعَافِيَةَ، فَإِذَا لَقِيتُمُوهُمْ فَاصْبِرُوا، وَاعْلَمُوا أَنَّ الْجَنَّةَ تَحْتَ ظِلاَلِ السُّيُوفِ، ثُمَّ قَالَ اللَّهُمَّ مُنْزِلَ الْكِتَابِ وَمُجْرِىَ السَّحَابِ وَهَازِمَ الأَحْزَابِ، اهْزِمْهُمْ وَانْصُرْنَا عَلَيْهِمْ». [رواه البخاري: ٢٩٦٥-٢٩٦٦]

**1274.** Abdullah ibn Əbu Əufə رضي الله عنه rəvayət etmişdir ki, döyüşlərin birində Peyğəmbər ﷺ düşmənlə qarşılaşdığı vaxt gün batmağa meyil edənədək gözlədi, sonra camaatın qarşısında ayağa qalxdı və (onlara xitab edib) dedi: "Ey insanlar, düşmənlə qarşı-qarşıya gəlməyi arzulamayın və Allahdan salamatlıq diləyin! Hərgah onlarla qarşı-qarşıya gəlsəniz, səbirli olun və bilin ki, Cənnət qılıncların kölgəsi altındadır." Sonra (dua edib) dedi: "Kitabı nazil edən, buludları hərəkətə gətirən və müttəfiqlərin toplumunu darmadağın edən Allahım, onları darmadağın et və onlara qələbə çalmaqda bizə kömək et![1]" (əl-Buxari, 2966-2965)

## 56-cı fəsil. Muzdlu işçi

## ٥٦- باب: الأَجِيرُ

١٢٧٥ - عَنْ يَعْلَى بْنِ أُمَيَّةَ رضي الله عنه قَالَ: غَزَوْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ غَزْوَةَ تَبُوكَ، فَحَمَلْتُ عَلَى بَكْرٍ، فَهْوَ أَوْثَقُ أَعْمَالِى فِى نَفْسِى، فَاسْتَأْجَرْتُ أَجِيرًا، فَقَاتَلَ رَجُلاً، فَعَضَّ أَحَدُهُمَا الآخَرَ فَانْتَزَعَ يَدَهُ مِنْ فِيهِ، وَنَزَعَ ثَنِيَّتَهُ، فَأَتَى النَّبِىَّ ﷺ فَأَهْدَرَهَا فَقَالَ: «أَيَدْفَعُ يَدَهُ إِلَيْكَ فَتَقْضَمُهَا كَمَا يَقْضَمُ الْفَحْلُ». [رواه البخاري: ٢٩٧٣]

**1275.** Rəvayət edilir ki, Yələ ibn Umeyyə رضي الله عنه demişdir: "Mən Peyğəmbərlə ﷺ birlikdə Təbuk döyüşündə iştirak etdim və yüklərimi cavan bir dəvəyə yüklədim – məncə gördüyüm işlərin ən etibarlısı da elə bu idi. (Həmin vaxt) mən bir işçi tutdum və o, başqa birisi ilə dalaşdı. (Dalaşanda) biri o birisinin əlini dişlədi və o birisi də əlini dişləyənin ağzından birdən dartıb çıxartdı və (əli ilə bərabər) onun ön dişlərini də yerindən qopartdı. Bu adam Peyğəmbərin ﷺ yanına (şikayətə) gəldi, lakin Peyğəmbər ﷺ onun şikayətini qəbul etməyib dedi: "İstəyirsən ki, əlini ona verəsən, o da dəvə dişlədiyi kimi sənin əlini dişləsin?!" (əl-Buxari, 2973)

## 57-ci fəsil. Peyğəmbərin ﷺ bayrağı haqqında deyilənlər

## ٥٧- باب: مَا قِيلَ فِى لِوَاءِ النَّبِىِّ ﷺ

١٢٧٦ - عَنْ الْعَبَّاسِ رضي الله عنه أَنَّهُ قَالَ لِلزُّبَيْرِ رضي الله عنه: هَا هُنَا أَمَرَكَ النَّبِىُّ ﷺ أَنْ تَرْكُزَ الرَّايَةَ. [رواه البخاري: ٢٩٧٦]

---

[1] Transkripsiyası: Allahummə munziləl-kitabi və mucriyəs-səhabi və hazimil-əhzabi, ihzimhum vənsurna aleyhim.

**1276.** Rəvayət edilir ki, (bir dəfə) Abbas ﷺ Zubeyrə dedi: “Peyğəmbər ﷺ sənə bayrağı bax buraya[1] sancmağı əmr etdi.” (əl-Buxari, 2976)

## ٥٨– باب: قَوْلُ النَّبِيِّ ﷺ: ﴿ نُصِرْتُ بِالرُّعْبِ مَسِيرَةَ شَهْرٍ ﴾

## 58-ci fəsil. Peyğəmbərin ﷺ: “ Bir ay əvvəlcədən (düşmənlərimin qəlbinə) qorxu salınmaqla mənə yardım edilmişdir”sözü

١٢٧٧ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «بُعِثْتُ بِجَوَامِعِ الْكَلِمِ، وَنُصِرْتُ بِالرُّعْبِ، فَبَيْنَا أَنَا نَائِمٌ أُتِيتُ بِمَفَاتِيحِ خَزَائِنِ الأَرْضِ، فَوُضِعَتْ فِى يَدِى». قَالَ أَبُو هُرَيْرَةَ وَقَدْ ذَهَبَ رَسُولُ اللَّهِ ﷺ وَأَنْتُمْ تَنْتَثِلُونَهَا. [رواه البخاري: ٢٩٧٧]

**1277.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən yığcam kəlmələrlə[2] (peyğəmbər) göndərildim, (bir ay əvvəlcədən düşmənlərimin qəlbinə) qorxu salınmaqla mənə yardım edildi və mən yuxuda ikən dünya xəzinələrinin açarları gətirilib əlimin içinə qoyuldu.”

Əbu Hureyra demişdir: “Peyğəmbər ﷺ artıq aranızdan getmişdir,[3] siz isə həmin xəzinələri çıxardıb istifadə edirsiniz.” (əl-Buxari, 2977)

## ٥٩– باب: حَمْلِ الزَّادِ فِى الْغَزْوِ، وَقَوْلِ اللَّهِ تَعَالَى: ﴿ وَتَزَوَّدُوا۟ فَإِنَّ خَيْرَ ٱلزَّادِ ٱلتَّقْوَىٰ ﴾

## 59-cu fəsil. Döyüşə getdikdə azuqə aparmaq. Uca Allah buyurur: “*Özünüzlə* azuqə götürün! Ən yaxşı azuqə isə təqvadır”[4].

١٢٧٨ – عَنْ أَسْمَاءَ ﷺ قَالَتْ: صَنَعْتُ سُفْرَةَ رَسُولِ اللَّهِ ﷺ فِى بَيْتِ أَبِى بَكْرٍ حِينَ أَرَادَ أَنْ يُهَاجِرَ إِلَى الْمَدِينَةِ، قَالَتْ فَلَمْ نَجِدْ لِسُفْرَتِهِ وَلاَ لِسِقَائِهِ مَا نَرْبِطُهُمَا بِهِ، فَقُلْتُ لأَبِى بَكْرٍ وَاللَّهِ مَا أَجِدُ شَيْئًا أَرْبِطُ بِهِ إِلاَّ نِطَاقِى. قَالَ فَشُقِّيهِ بِاثْنَيْنِ، فَارْبِطِيهِ بِوَاحِدٍ السِّقَاءَ وَبِالآخَرِ السُّفْرَةَ. فَفَعَلْتُ، فَلِذَلِكَ سُمِّيَتْ ذَاتَ النِّطَاقَيْنِ. [رواه البخاري: ٢٩٧٩]

**1278.** Rəvayət edilir ki, Əsma ﷺ demişdir: “Peyğəmbər ﷺ Mədinəyə hicrət etmək istədikdə mən Əbu Bəkrin evində ona yol azuqəsi hazırladım, lakin bu azuqənin və su tuluğunun ağzını bağlamağa ip tapa bilmədim. Onda mən Əbu Bəkrə dedim: “Mən bunları bağlamaq üçün toqqamdan başqa bir şey tapa bilmirəm.” Əbu Bəkr: “Toqqanı iki hissəyə böl, birisi ilə su tuluğunun, o birisi ilə də azuqənin ağzını bağla”– dedi, mən də (onun dediyi kimi) etdim.”

---

[1] İmam əl-Buxarinin nəql etdiyi 4280-cı hədisdə bayrağın Məkkədəki Həcun dağına sancılması xəbər verilmişdir.

[2] Hərəvi demişdir: “Burada “yığcam kəlmələr” deyildikdə Quran və hədis nəzərdə tutulur. Uca Allahın Öz Kitabında cəm etdiyi, habelə Peyğəmbərimizin ﷺ hədislərində varid olan kəlmələr yığcam olmasına baxmayaraq, çoxmənalı kəlmələrdir.” (Şərhu-Səhih-Muslim, 2/280)

[3] Peyğəmbər ﷺ əlinin içində olan xəzinələrdən istifadə etmədən dünyadan köçüb getmişdir.

[4] “əl-Bəqərə” surəsi, 197.

(Hədisin ravisi demişdir:) “(Elə bu səbəbdən də) ona “ikitoqqalı” ləqəbi verildi.” (əl-Buxari, 2979)

## 60-cı fəsil. Uzunqulağın üstündə olan kimsənin başqa birisini tərkinə alması

## ٦٠– باب: الرِّدْفُ عَلَى الحِمَارِ

١٢٧٩ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ﵄ أَنَّ رَسُولَ اللَّهِ ﷺ رَكِبَ عَلَى حِمَارٍ، عَلَى إِكَافٍ عَلَيْهِ قَطِيفَةٌ، وَأَرْدَفَ أُسَامَةَ وَرَاءَهُ. [رواه البخاري: ٢٩٨٧]

**1279.** Usamə ibn Zeyddən ﵄ rəvayət edilmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ belinə xovlu[1] parça salınmış uzunqulağa mindi və Usaməni də tərkinə aldı. (əl-Buxari, 2987)

١٢٨٠ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﵄ أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَقْبَلَ يَوْمَ الْفَتْحِ مِنْ أَعْلَى مَكَّةَ عَلَى رَاحِلَتِهِ، مُرْدِفًا أُسَامَةَ بْنَ زَيْدٍ وَمَعَهُ بِلاَلٌ وَمَعَهُ عُثْمَانُ بْنُ طَلْحَةَ مِنَ الْحَجَبَةِ، حَتَّى أَنَاخَ فِى الْمَسْجِدِ، فَأَمَرَهُ أَنْ يَأْتِىَ بِمِفْتَاحِ الْبَيْتِ، فَفَتَحَ وَدَخَلَ رَسُولُ اللَّهِ ﷺ وَمَعَهُ أُسَامَةُ وَبِلاَلٌ وَعُثْمَانُ، فَمَكَثَ فِيهَا نَهَارًا طَوِيلاً ثُمَّ خَرَجَ ، فَاسْتَبَقَ النَّاسُ، وَكَانَ عَبْدُ اللَّهِ بْنُ عُمَرَ أَوَّلَ مَنْ دَخَلَ، فَوَجَدَ بِلاَلاً وَرَاءَ الْبَابِ قَائِمًا، فَسَأَلَهُ أَيْنَ صَلَّى رَسُولُ اللَّهِ ﷺ فَأَشَارَ لَهُ إِلَى الْمَكَانِ الَّذِى صَلَّى فِيهِ، قَالَ عَبْدُ اللَّهِ فَنَسِيتُ أَنْ أَسْأَلَهُ كَمْ صَلَّى مِنْ سَجْدَةٍ. [رواه البخاري: ٢٩٨٨]

**1280.** Abdullah ibn Ömərdən ﵄ rəvayət edilir ki, Peyğəmbər ﷺ Məkkənin fəthi günü öz dəvəsinin üstündə Məkkənin yuxarı tərəfindən şəhərə daxil olduqda Usamə ibn Zeyd onun tərkində idi, Bilal və (özünə açar həvalə edilmiş) Osman ibn Təlhə[2] isə onları müşayiət edirdilər. Nəhayət, Peyğəmbər ﷺ dəvəsini məsciddə yerə çökdürdü və (müqəddəs) Evin açarını gətirməyi əmr etdi. Sonra Peyğəmbər ﷺ qapını açıb içəri daxil oldu. Onunla bərabər Usamə, Bilal və Osman da içəri daxil oldular. Peyğəmbər ﷺ uzun müddət içəridə qaldıqdan sonra bayıra çıxdı. Bundan sonra camaat (Kəbəyə daxil olmağa) tələsdi və oraya ilk daxil olan kəs Abdullah ibn Ömər oldu. Həmin vaxt o, qapının arxasında durmuş Bilalı gördü və ondan: “Peyğəmbər ﷺ harada namaz qıldı?”– deyə soruşdu. Bilal ona Peyğəmbərin ﷺ namaz qıldığı yeri göstərdi.

Abdullah ibn Ömər ﵄ demişdir: “Mən ondan (Peyğəmbərin ﷺ) neçə səcdə etdiyini soruşmağı unutdum.” (əl-Buxari, 2988)

## 61-ci fəsil. Quran Kitabını düşmən ölkəsinə aparmağın bəyənilməməsi

## ٦١– باب: كَرَاهِيَّةُ السَّفَرِ بِالْمَصَاحِفِ إِلَى أَرْضِ الْعَدُوِّ

١٢٨١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﵄ أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى أَنْ يُسَافَرَ بِالْقُرْآنِ إِلَى أَرْضِ الْعَدُوِّ. [رواه البخاري: ٢٩٩٠]

---

[1] Xov: bəzi parçaların, xalça və s. üzərində incə tükcüklər.

[2] Bu həmin əshabədir ki, Peyğəmbər ﷺ Kəbənin açarını saxlamağı ona həvalə etmişdir. Qeyd etmək lazımdır ki, açar indiyədək Osman ibn Təlhənin ﵁ nəsli tərəfindən qorunub saxlanılmışdır.

**1281.** Abdullah ibn Ömər ﵄ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ Quranı düşmən ölkəsinə aparmağı qadağan etmişdir." (əl-Buxari, 2990)

## 62-ci fəsil. Nə zaman "Allahu Əkbər" sözünü bərkdən demək bəyənilmir

## ٦٢- باب: مَا يُكْرَهُ مِنْ رَفْعِ الصَّوْتِ فِي التَّكْبِيرِ

١٢٨٢ – عَنْ أَبِي مُوسَى الأَشْعَرِيِّ ﵁ قَالَ: كُنَّا مَعَ رَسُولِ اللَّهِ ﷺ، فَكُنَّا إِذَا أَشْرَفْنَا عَلَى وَادٍ هَلَّلْنَا وَكَبَّرْنَا ارْتَفَعَتْ أَصْوَاتُنَا، فَقَالَ النَّبِيُّ ﷺ: «يَا أَيُّهَا النَّاسُ، ارْبَعُوا عَلَى أَنْفُسِكُمْ، فَإِنَّكُمْ لاَ تَدْعُونَ أَصَمَّ وَلاَ غَائِبًا، إِنَّهُ مَعَكُمْ، إِنَّهُ سَمِيعٌ قَرِيبٌ، تَبَارَكَ اسْمُهُ وَتَعَالَى جَدُّهُ». [رواه البخاري: ٢٩٩٢]

**1282.** Rəvayət edilir ki, Əbu Musa Əşari ﵁ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə (səfərdə olarkən) hər hansı bir vadiyə endikdə uca səslə: "Lə ilahə illəllah" və "Allahu Əkbər"– deyərdik. Sonra Peyğəmbər ﷺ buyurdu: "Ey insanlar, özünüzə yazığınız gəlsin! Axı siz nə kar, nə də uzaqda olan (bir tanrını) çağırırsınız. Həqiqətən də, (Allah) sizinlədir və O, Eşidəndir, Yaxındır! Onun adı mübarək, əzəməti isə ucadır!" (əl-Buxari, 2992)

## 63-cü fəsil. Vadiyə endikdə "Sübhanəllah!" demək

## ٦٣- باب: التَّسْبِيحُ إِذَا هَبَطَ وَادِيًا

١٢٨٣ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵄ قَالَ: كُنَّا إِذَا صَعِدْنَا كَبَّرْنَا، وَإِذَا نَزَلْنَا سَبَّحْنَا. [رواه البخاري: ٢٩٩٣]

**1283.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: "Biz (hündür bir yerə) qalxdıqda: "Allahu Əkbər" deyər, (hər hansı bir vadiyə) endikdə isə "Sübhanəllah!"– deyərdik." (əl-Buxari, 2993)

## 64-cü fəsil. Səfərdə olan adama, evində etdiyi əməllərin savabı qədər savab yazılır

## ٦٤- باب: يُكْتَبُ لِلْمُسَافِرِ مِثْلُ مَا كَانَ يَعْمَلُ فِي الإِقَامَةِ

١٢٨٤ – عَنْ أَبِي مُوسَى ﵁ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِذَا مَرِضَ الْعَبْدُ أَوْ سَافَرَ، كُتِبَ لَهُ مِثْلُ مَا كَانَ يَعْمَلُ مُقِيمًا صَحِيحًا». [رواه البخاري: ٢٩٩٦]

**1284.** Əbu Musa ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Mömin) bəndə xəstələndiyi və ya səfərdə olduğu zaman ona evində, həm də sağlam olarkən etdiyi əməllərin savabı qədər savab yazılır." (əl-Buxari, 2996)

## 65-ci fəsil. Təkbaşına səfərə çıxmaq

## ٦٥- باب: السَّيْرُ وَحْدَهُ

١٢٨٥ – عَنْ ابْنِ عُمَرَ ﵄ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لَوْ يَعْلَمُ النَّاسُ مَا فِي الْوَحْدَةِ مَا أَعْلَمُ مَا سَارَ رَاكِبٌ بِلَيْلٍ وَحْدَهُ». [رواه البخاري: ٢٩٩٨]

**1285.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əgər insanlar təkbaşına səfərə çıxmaq barəsində mən bildiyimi bilsəydilər, heç bir müsafir gecə vaxtı təkbaşına səfərə çıxmazdı." (əl-Buxari, 2998)

## 66-cı fəsil. Cihada ata-ananın izni ilə getmək

## ٦٦– باب: الْجِهَادُ بِإِذْنِ الأَبَوَيْنِ

١٢٨٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﷺ قَالَ: جَاءَ رَجُلٌ إِلَى النَّبِيِّ ﷺ فَاسْتَأْذَنَهُ فِى الْجِهَادِ فَقَالَ: «أَحَيٌّ وَالِدَاكَ؟» قَالَ نَعَمْ، قَالَ: «فَفِيهِمَا فَجَاهِدْ». [رواه البخاري: ٣٠٠٤]

**1286.** Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: "(Bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib cihada getmək üçün izn istədi. Peyğəmbər ﷺ soruşdu: "Valideynlərin sağdırmı?" O: "Bəli!"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Elə isə onlar üçün çalış." (əl-Buxari, 3004)

## 67-ci fəsil. Dəvənin boynundan zınqırov və buna bənzər bir şey asmaq barədə deyilənlər

## ٦٧– باب: مَا قِيلَ فِى الْجَرَسِ وَنَحْوِهِ فِى أَعْنَاقِ الإِبِلِ

١٢٨٧ – عَنْ أَبِي بَشِيرٍ الأَنْصَارِيِّ ﷺ، أَنَّهُ كَانَ مَعَ رَسُولِ اللَّهِ ﷺ فِى بَعْضِ أَسْفَارِهِ وَالنَّاسُ فِى مَبِيتِهِمْ، فَأَرْسَلَ رَسُولُ اللَّهِ ﷺ رَسُولاً أَنْ لاَ يَبْقَيَنَّ فِى رَقَبَةِ بَعِيرٍ قِلاَدَةٌ مِنْ وَتَرٍ أَوْ قِلاَدَةٌ إِلاَّ قُطِعَتْ. [رواه البخاري: ٣٠٠٥]

**1287.** Əbu Bəşir əl-Ənsari ﷺ rəvayət etmişdir ki, (bir dəfə) o, Peyğəmbərlə ﷺ birlikdə səfərdə olarkən və bu əsnada camaat yatmağa hazırlaşarkən Peyğəmbər ﷺ onların yanına bir elçi göndərdi (ki, onlara desin): "Heç bir dəvənin boynunda kirişdən[1] düzəldilmiş boyunbağı qalmasın və ya kəsilib atılmamış bir (dənə də olsun) boyunbağı qalmamalıdır." (əl-Buxari, 3005)

## 68-ci fəsil. Orduya yazılmış bir kimsənin zövcəsi həcc ziyarətinə getmişsə və ya həmin adamın (başqa) bir üzrlü səbəbi varsa, ona (tərxis olunmağa) izn verilirmi?

## ٦٨– باب: مَنِ اكْتُتِبَ فِى جَيْشٍ فَخَرَجَت امْرَأَتُهُ حَاجَّةً، وَكَانَ لَهُ عُذْرٌ، هَلْ يُؤْذَنُ لَهُ؟

١٢٨٨ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ: «لاَ يَخْلُوَنَّ رَجُلٌ بِامْرَأَةٍ، وَلاَ تُسَافِرَنَّ امْرَأَةٌ إِلاَّ وَمَعَهَا مَحْرَمٌ». فَقَامَ رَجُلٌ فَقَالَ: يَا رَسُولَ اللَّهِ، اكْتُتِبْتُ فِى غَزْوَةِ كَذَا وَكَذَا، وَخَرَجَتِ امْرَأَتِى حَاجَّةً. قَالَ: «اذْهَبْ فَحُجَّ مَعَ امْرَأَتِكَ». [رواه البخاري: ٣٠٠٦]

**1288.** Rəvayət edilir ki, ibn Abbas ﷺ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Heç bir kişi (naməhrəm) bir qadınla təklikdə qalmamalı və heç bir qadın ya-

---

[1] Kiriş: ox yayının iki ucuna tarım bağlanan ip.

nında məhrəmi olmadan səfərə çıxmamalıdır!" Bu vaxt bir nəfər ayağa qalxıb dedi: "Ya Rəsulullah, mən filan (döyüşdə iştirak etmək üçün) orduya yazılmışam, zövcəm isə həcc ziyarəti üçün yola çıxmışdır." Peyğəmbər ﷺ buyurdu: "Get, zövcənlə birlikdə həcc ziyarətini yerinə yetir!" (əl-Buxari, 3006)

## 69-cu fəsil. Əsirlərin zəncirlənməsi

## ٦٩- باب: الأُسَارَى فِى السَّلاَسِلِ

١٢٨٩ - عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «عَجِبَ اللَّهُ مِنْ قَوْمٍ يَدْخُلُونَ الْجَنَّةَ فِى السَّلاَسِلِ». [رواه البخاري: ٣٠١٠]

**1289.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah zəncirlənmiş əsirlərin[1] Cənnətə daxil olacağına təəccüb edəcək!" (əl-Buxari, 3010)

## 70-ci fəsil. Düşmən ölkəsinə gecə vaxtı hücum etmək və hücum nəticəsində uşaqların öldürülməsi (yolverilməzdir)

## ٧٠- باب: أَهْلُ الدَّارِ يُبَيَّتُونَ فَيُصَابُ الْوِلْدَانُ وَالذَّرَارِىُّ

١٢٩٠ - عَنْ الصَّعْبِ بْنِ جَثَّامَةَ ﷺ قَالَ: مَرَّ بِىَ النَّبِىُّ ﷺ بِالأَبْوَاءِ - أَوْ بِوَدَّانَ - وَسُئِلَ عَنْ أَهْلِ الدَّارِ يُبَيَّتُونَ مِنَ الْمُشْرِكِينَ، فَيُصَابُ مِنْ نِسَائِهِمْ وَذَرَارِيِّهِمْ قَالَ: «هُمْ مِنْهُمْ»، وَسَمِعْتُهُ يَقُولُ: «لاَ حِمَى إِلاَّ لِلَّهِ وَلِرَسُولِهِ ﷺ». [رواه البخاري: ٣٠١٢]

**1290.** Rəvayət edilir ki, Səb ibn Cəssamə ﷺ demişdir: "Peyğəmbər ﷺ Əbvada (və ya Vəddanda) mənim yanımdan keçərkən ondan, gecə vaxtı müşriklərə hücum etmək və (hücum əsnasında) qadınların və uşaqların ölə biləcəyi barədə soruşdular." Dedi: "Bunlar onların bir parçasıdır."

Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Qoruqlar ancaq Allaha və Onun elçisinə ﷺ aiddir.[2]" (əl-Buxari, 3012)

## 71-ci fəsil. Döyüş əsnasında uşaqların öldürülməsi (yolverilməzdir)

## ٧١- باب: قَتْلُ الصِّبْيَانِ فِى الْحَرْبِ

١٢٩١ - عَنْ عَبْدِ اللَّهِ ﷺ أَنَّ امْرَأَةً وُجِدَتْ فِى بَعْضِ مَغَازِى النَّبِىِّ ﷺ مَقْتُولَةً، فَأَنْكَرَ رَسُولُ اللَّهِ ﷺ قَتْلَ النِّسَاءِ وَالصِّبْيَانِ. [رواه البخاري: ٣٠١٤]

**1291.** Abdullah ibn Ömər ﷺ rəvayət etmişdir ki, Peyğəmbərin ﷺ apardığı döyüşlərin birində bir qadın meyiti tapıldı. Elə bu səbəbdən də Peyğəmbər ﷺ qadınların və uşaqların öldürülməsini qadağan etdi. (əl-Buxari, 3014)

---

[1] Bunlar o kəslərdir ki, kafir ikən döyüşdə əsir düşmüş, sonra müsəlmanların vasitəsilə İslam dinini qəbul etmiş və bundan sonra da Qiyamət günü iman əhli ilə birgə Cənnətə daxil olacaqlar.

[2] 1095-ci hədisin qeydlərinə bax.

## 72-ci fəsil. Allahın əzabı ilə əzab vermək olmaz

## ٧٢- باب: لاَ يُعَذَّبُ بِعَذَابِ اللَّهِ

١٢٩٢ – عَنْ عَلِيٍّ ﷺ حَرَّقَ قَوْمًا، فَبَلَغَ ابْنَ عَبَّاسٍ فَقَالَ لَوْ كُنْتُ أَنَا لَمْ أُحَرِّقْهُمْ، لأَنَّ النَّبِيَّ ﷺ قَالَ: «لاَ تُعَذِّبُوا بِعَذَابِ اللَّهِ». وَلَقَتَلْتُهُمْ كَمَا قَالَ النَّبِيُّ ﷺ: «مَنْ بَدَّلَ دِينَهُ فَاقْتُلُوهُ». [رواه البخاري: ٣٠١٧]

**1292.** Rəvayət edilir ki, Əlinin ﷺ bir dəstə adamı[1] yandırdığı barədə xəbər ibn Abbasa ﷺ çatdıqda o demişdir: "Mən (onun yerində) olsaydım, onları yandırmazdım. Çünki Peyğəmbər ﷺ demişdir: "Allahın əzabı ilə əzab verməyin!" Mən (sadəcə) onları öldürərdim. Necə ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Dinini dəyişən kimsəni öldürün!" (əl-Buxari, 3017)

## 73-cü fəsil

## ٧٣- باب

١٢٩٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «قَرَصَتْ نَمْلَةٌ نَبِيًّا مِنَ الأَنْبِيَاءِ، فَأَمَرَ بِقَرْيَةِ النَّمْلِ فَأُحْرِقَتْ، فَأَوْحَى اللَّهُ إِلَيْهِ أَنْ قَرَصَتْكَ نَمْلَةٌ أَحْرَقْتَ أُمَّةً مِنَ الأُمَمِ تُسَبِّحُ». [رواه البخاري: ٣٠١٩]

**1293.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "(Bir dəfə) bir qarışqa peyğəmbərlərdən birini dişlədi və o, qarışqa yuvasının yandırılmasını əmr etdi." Onda Allah ona belə vəhy etdi: "Səni qarışqa dişlədi deyə, Allahın şəninə təriflər deyən bir ümməti yandırdın!" (əl-Buxari, 3019)

## 74-cü fəsil. Evləri və xurmalıqları yandırmaq

## ٧٤- باب: حَرْقُ الدُّورِ وَالنَّخِيلِ

١٢٩٤ – عَنْ جَرِيرِ بْنِ عَبْدِ اللهِ ﷺ قَالَ: قَالَ لِي رَسُولُ اللَّهِ ﷺ: «أَلاَ تُرِيحُنِي مِنْ ذِي الْخَلَصَةِ». وَكَانَ بَيْتًا فِي خَثْعَمَ يُسَمَّى كَعْبَةَ الْيَمَانِيَةَ قَالَ فَانْطَلَقْتُ فِي خَمْسِينَ وَمِائَةِ فَارِسٍ مِنْ أَحْمَسَ، وَكَانُوا أَصْحَابَ خَيْلٍ – قَالَ – وَكُنْتُ لاَ أَثْبُتُ عَلَى الْخَيْلِ، فَضَرَبَ فِي صَدْرِي حَتَّى رَأَيْتُ أَثَرَ أَصَابِعِهِ فِي صَدْرِي وَقَالَ: «اللَّهُمَّ ثَبِّتْهُ وَاجْعَلْهُ هَادِيًا مَهْدِيًّا». فَانْطَلَقَ إِلَيْهَا فَكَسَرَهَا وَحَرَّقَهَا، ثُمَّ بَعَثَ إِلَى رَسُولِ اللَّهِ ﷺ يُخْبِرُهُ فَقَالَ رَسُولُ جَرِيرٍ وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ، مَا جِئْتُكَ حَتَّى تَرَكْتُهَا كَأَنَّهَا جَمَلٌ أَجْوَفُ أَوْ أَجْرَبُ. قَالَ فَبَارَكَ فِي خَيْلِ أَحْمَسَ وَرِجَالِهَا خَمْسَ مَرَّاتٍ. [رواه البخاري: ٣٠٢٠]

**1294.** Cərir ibn Abdullah ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ mənə dedi: "Zül-Xələsəni (yox etməklə) mənim qəlbimi rahat etmək istəmirsənmi?" Zül-Xələsə Xəsəm qəbiləsində yerləşən, Yəmən kəbəsi adlanan bir bütxana idi. Mən Əhməs qəbiləsindən olan yüz əlli nəfərlik bir süvari dəstədə (oraya) yollandım. Əhməsilər yaxşı at sürən adamlar idi. Mən isə atın belində dura bilmirdim. (Bu vaxt) Peyğəmbər ﷺ (əli ilə) mənim sinəmə elə bir zərbə vurdu ki, barmaqlarının izi sinəmdə qaldı, (sonra da dua edib) dedi: "Allahım, onu sabitqədəm et, onu doğru yol göstərən və doğru yolda olan (kimsələrdən) et!"

[1] Söhbət Əlini ﷺ Allah elan etmiş kufəlilərdən gedir.

Bundan sonra Cərir bütxanaya getdi və onu darmadağın edib yandırdı. Sonra da Peyğəmbərin ﷺ yanına adam göndərdi (ki, nə etdiyini) ona xəbər versin. Cəririn göndərdiyi adam (Peyğəmbərə ﷺ) dedi: "Səni haqq ilə göndərən Allaha and olsun ki, mən gələndə o (bütxana) haldan düşmüş və ya qotur xəstəliyinə tutulmuş bir dəvə kimi (yanıb qapqara) olmuşdu."

(Cərir) dedi: "Bundan sonra Peyğəmbər ﷺ əhməsilərdən ibarət olan bu dəstəyə və onlara qoşulanlara (Allahdan) beş dəfə xeyir-bərəkət dilədi." (əl-Buxari, 3020)

## 75-ci fəsil. Müharibə aldatmadır[1]

## ٧٥- باب: الْحَرْبُ خَدْعَةٌ

١٢٩٥ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِىِّ ﷺ قَالَ: «هَلَكَ كِسْرَى ثُمَّ لاَ يَكُونُ كِسْرَى بَعْدَهُ، وَقَيْصَرٌ لَيَهْلِكَنَّ ثُمَّ لاَ يَكُونُ قَيْصَرٌ بَعْدَهُ، وَلَتُقْسَمَنَّ كُنُوزُهَا فِى سَبِيلِ اللَّهِ». [رواه البخاري: ٣٠٢٧]

**1295.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Xosrov[2] həlak olacaq və ondan sonra onun yerinə xosrov gəlməyəcək. Qeysər[3] həlak olacaq və ondan sonra onun yerinə qeysər gəlməyəcək. Onların sahib olduqları xəzinələr isə Allah yolunda (qənimət olaraq) paylaşdırılacaq." (əl-Buxari, 3027)

١٢٩٦ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ: سَمَّى النَّبِىُّ ﷺ الْحَرْبَ خُدْعَةً. [رواه البخاري: ٣٠٢٩]

**1296.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ müharibəni "aldatma" adlandırmışdır." (əl-Buxari, 3029)

## 76-cı fəsil. Döyüşdə mübahisə etməyin və ixtilafa düşməyin bəyənilməməsi və əmirə qarşı çıxanların cəzası

## ٧٦- باب: مَا يُكْرَهُ مِنَ التَّنَازُعِ وَالاخْتِلاَفِ فِى الْحَرْبِ وَعُقُوبَةُ مَنْ عَصَى إِمَامَهُ

١٢٩٧ – عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ رضي الله عنهما قَالَ: جَعَلَ النَّبِىُّ ﷺ عَلَى الرَّجَّالَةِ يَوْمَ أُحُدٍ – وَكَانُوا خَمْسِينَ رَجُلاً – عَبْدَ اللَّهِ بْنَ جُبَيْرٍ فَقَالَ: «إِنْ رَأَيْتُمُونَا تَخْطَفُنَا الطَّيْرُ، فَلاَ تَبْرَحُوا مَكَانَكُمْ هَذَا حَتَّى أُرْسِلَ إِلَيْكُمْ، وَإِنْ رَأَيْتُمُونَا هَزَمْنَا الْقَوْمَ وَأَوْطَأْنَاهُمْ فَلاَ تَبْرَحُوا حَتَّى أُرْسِلَ إِلَيْكُمْ» فَهَزَمُوهُمْ. قَالَ فَأَنَا وَاللَّهِ رَأَيْتُ النِّسَاءَ يَشْتَدِدْنَ قَدْ بَدَتْ خَلاَخِلُهُنَّ وَأَسْوُقُهُنَّ رَافِعَاتٍ ثِيَابَهُنَّ، فَقَالَ أَصْحَابُ عَبْدِ اللَّهِ بْنِ جُبَيْرٍ الْغَنِيمَةَ – أَىْ قَوْمِ – الْغَنِيمَةَ، ظَهَرَ أَصْحَابُكُمْ فَمَا تَنْتَظِرُونَ فَقَالَ عَبْدُ اللَّهِ بْنُ جُبَيْرٍ أَنَسِيتُمْ مَا قَالَ لَكُمْ رَسُولُ اللَّهِ ﷺ قَالُوا وَاللَّهِ لَنَأْتِيَنَّ النَّاسَ فَلَنُصِيبَنَّ مِنَ الْغَنِيمَةِ. فَلَمَّا أَتَوْهُمْ صُرِفَتْ وُجُوهُهُمْ فَأَقْبَلُوا مُنْهَزِمِينَ، فَذَاكَ إِذْ يَدْعُوهُمُ الرَّسُولُ فِى أُخْرَاهُمْ، فَلَمْ يَبْقَ مَعَ النَّبِىِّ ﷺ غَيْرُ اثْنَىْ عَشَرَ رَجُلاً، فَأَصَابُوا مِنَّا سَبْعِينَ، وَكَانَ النَّبِىُّ ﷺ وَأَصْحَابُهُ أَصَابَ مِنَ الْمُشْرِكِينَ يَوْمَ بَدْرٍ أَرْبَعِينَ وَمِائَةً سَبْعِينَ أَسِيرًا وَسَبْعِينَ قَتِيلاً، فَقَالَ أَبُو سُفْيَانَ أَفِى الْقَوْمِ مُحَمَّدٌ ثَلاَثَ مَرَّاتٍ،

---

[1] Burada döyüş əsnasında kafirləri aldatmaq, onlara qarşı hiylə qurmaq və ümumiyyətlə, hər cür taktikadan istifadə etmək nəzərdə tutulur.

[2] Fars şahlarının titulu.

[3] Rum imperatorlarının titulu.

فَنَهَاهُمُ النَّبِىُّ ﷺ أَنْ يُجِيبُوهُ ثُمَّ قَالَ أَفِى الْقَوْمِ ابْنُ أَبِى قُحَافَةَ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ قَالَ أَفِى الْقَوْمِ ابْنُ الْخَطَّابِ ثَلاَثَ مَرَّاتٍ، ثُمَّ رَجَعَ إِلَى أَصْحَابِهِ فَقَالَ أَمَّا هَؤُلاَءِ فَقَدْ قُتِلُوا. فَمَا مَلَكَ عُمَرُ نَفْسَهُ فَقَالَ كَذَبْتَ وَاللَّهِ يَا عَدُوَّ اللَّهِ، إِنَّ الَّذِينَ عَدَدْتَ لأَحْيَاءٌ كُلُّهُمْ، وَقَدْ بَقِىَ لَكَ مَا يَسُوؤُكَ. قَالَ يَوْمٌ بِيَوْمِ بَدْرٍ، وَالْحَرْبُ سِجَالٌ، إِنَّكُمْ سَتَجِدُونَ فِى الْقَوْمِ مُثْلَةً لَمْ آمُرْ بِهَا وَلَمْ تَسُؤْنِى، ثُمَّ أَخَذَ يَرْتَجِزُ أُعْلُ هُبَلْ، أُعْلُ هُبَلْ. قَالَ النَّبِىُّ ﷺ: «أَلاَ تُجِيبُوا لَهُ». قَالُوا يَا رَسُولَ اللَّهِ، مَا نَقُولُ قَالَ: «قُولُوا اللَّهُ أَعْلَى وَأَجَلُّ». قَالَ إِنَّ لَنَا الْعُزَّى وَلاَ عُزَّى لَكُمْ. فَقَالَ النَّبِىُّ ﷺ: «أَلاَ تُجِيبُوا لَهُ». قَالَ قَالُوا يَا رَسُولَ اللَّهِ، مَا نَقُولُ قَالَ: «قُولُوا اللَّهُ مَوْلاَنَا وَلاَ مَوْلَى لَكُمْ». [رواه البخاري: ٣٠٣٩]

**1297.** Rəvayət edilir ki, Bəra ibn Azib ﵁ demişdir: “Peyğəmbər ﷺ Uhud döyüşündə əlli nəfərlik oxçu dəstəsinə Abdullah ibn Cubeyri başçı təyin etmiş və demişdir: “Quşların cəsədlərimizi dimdikləyib yediyini görsəniz belə, mən sizə xəbər göndərməyincə yerinizdən ayrılmayın! Bizim düşməni darmadağın edib onları tapdaladığımızı görsəniz belə, mən sizə xəbər göndərməyincə (yerinizdən) ayrılmayın!”

Müsəlmanlar (ilk həmlədə) düşməni darmadağın etdilər. Vallahi ki, mən qadınların[1] paltarlarının ətəyini əllərinə alıb qaçdığını gördüm. Onların xalxalları[2] və ayaqları görünürdü. Bu vaxt Abdullah ibn Cubeyrin dəstəsindəki oxçular: “Qənimət! Ay camaat, qənimət! Qardaşlarımız qalib gəldilər! Siz nəyi gözləyirsiniz?!”– dedilər. Abdullah ibn Cubeyr dedi: “Peyğəmbərin ﷺ sizə dediklərini nə tez unutdunuz?!” Onlar: “Vallahi, biz camaatın yanına gedib (payımıza düşən) qənimətləri götürəcəyik”– deyib ora yüyürdülər. (Müşriklər də bu fürsətdən istifadə edib əks hücuma keçdilər,[3] nəticədə isə) müsəlmanlar qaçmağa üz tutdular və məğlubiyyətə uğradılar. Həmin vaxt Peyğəmbər ﷺ arxa tərəfdən onları çağırırdı.[4] Peyğəmbərin ﷺ yanında cəmi on iki nəfər adam var idi. (Müşriklər) bizdən yetmiş nəfəri şəhid etmişdilər. (Halbuki) Bədr döyüşündə Peyğəmbər ﷺ və onun əshabələri müşriklərdən yüz qırx nəfərin başına müsibət gətirmiş – yetmişini əsir götürmüş, yetmişini də öldürmüşdülər. (Müsəlmanlar geri çəkildikdən sonra) Əbu Süfyan (onlara yaxınlaşdı və) üç dəfə (qışqırıb) dedi: “Muhəmməd aranızdadırmı?” Peyğəmbər ﷺ əshabələrinə ona cavab verməyi qadağan etdi. O, (yenə) üç dəfə (qışqırıb) dedi: “Əbu Quhafənin oğlu[5] aranızdadırmı?” (Yenə) üç dəfə (qışqırıb) dedi: “Xəttabın oğlu[6] aranızdadırmı?” Bundan sonra o, müşriklərin yanına qayıdıb dedi: “Bu üçü artıq öldürülmüşdür.” Onda Ömər özünü saxlaya bilməyib dedi: “Vallahi, yalan danışdın, ey Allahın düşməni! Həqiqətən, adlarını çəkdiyin adamların hamısı sağdır və sənin məyus qalacağın günlərin hələ qabaqdadır.” Əbu Süfyan dedi: “Bu gün, Bədr gününün əvəzi-

[1] Bunlar, müşriklərin özləri ilə gətirdikləri qadınlar idi.

[2] Keçmişdə qadınların yaraşıq üçün topuqlarına taxdıqları gümüş, qızıl və s.-dən düzəldilmiş zınqırovlu halqa, bilərzik.

[3] O vaxt Xalid ibn Vəlid ﵁ hələ müşrik idi və bu döyüşdə müşriklərin süvari dəstəsinə başçılıq edirdi. O, Abdullah ibn Cubeyr ﵁ və onun yanında qalmış ona yaxın əshabədən başqa oxçuların tutduqları mövqeni qoyub getdiklərini gördükdə əks hücuma keçmiş və müsəlmaları məğlubiyyətə uğratmışdır.

[4] Bax: “Ali-İmran” surəsi, 153-154.

[5] Yəni Əbu Bəkr ﵁.

[6] Yəni Ömər ﵁.

dir. (Bilin ki,) döyüş dəyişkəndir.[1] Siz ölülərinizin eybəcər hala salınmış olduğunu görəcəksiniz. Hərçənd bunu mən əmr etməmişəm, lakin bu məni heç kədərləndirmir də." Sonra o, təntənəli surətdə: "Yaşasın Hubəl![2] Yaşasın Hubəl!"- deyə qışqırdı. Peyğəmbər ﷺ (əshabələrinə): "Onun cavabını verməyəcəksinizmi?!"– deyə buyurdu. Əshabələr soruşdular: "Nə deyək, ya Rəsulullah?" Peyğəmbər ﷺ buyurdu: "Deyin: "Allah (hər şeydən) uca və uludur!" Əbu Süfyan isə (cavabında belə) dedi: "Bizim Uzzamız[3] var, sizin isə belə bir bütünüz yoxdur!" Peyğəmbər ﷺ: "Onun cavabını verməyəcəksinizmi?!"– deyə buyurdu. Əshabələr soruşdular: "Nə deyək, ya Rəsulullah?" Peyğəmbər ﷺ buyurdu: "Deyin: "Allah bizim himayədarımızdır, sizin isə himayədarınız yoxdur!" (əl-Buxari, 3039)

## ٧٧- باب:
## مَنْ رَأَى الْعَدُوَّ فَنَادَى بِأَعْلَى صَوْتِهِ يَا صَبَاحَاهْ، حَتَّى يُسْمِعَ النَّاسَ

## 77-ci fəsil.
## Düşməni görüb, camaatı xəbərdar etmək məqsədilə uca səslə "Köməyə gəlin!" deyə qışqıran kimsə haqqında

١٢٩٨ – عَنْ سَلَمَةَ ﷺ قَالَ: خَرَجْتُ مِنَ الْمَدِينَةِ ذَاهِبًا نَحْوَ الْغَابَةِ، حَتَّى إِذَا كُنْتُ بِثَنِيَّةِ الْغَابَةِ لَقِيَنِي غُلاَمٌ لِعَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ قُلْتُ وَيْحَكَ، مَا بِكَ قَالَ أُخِذَتْ لِقَاحُ النَّبِيِّ ﷺ. قُلْتُ مَنْ أَخَذَهَا قَالَ غَطَفَانُ وَفَزَارَةُ. فَصَرَخْتُ ثَلاَثَ صَرَخَاتٍ أَسْمَعْتُ مَا بَيْنَ لاَبَتَيْهَا يَا صَبَاحَاهْ، يَا صَبَاحَاهْ. ثُمَّ انْدَفَعْتُ حَتَّى أَلْقَاهُمْ وَقَدْ أَخَذُوهَا، فَجَعَلْتُ أَرْمِيهِمْ وَأَقُولُ:

أَنَا ابْنُ الأَكْوَعِ، وَالْيَوْمُ يَوْمُ الرُّضَّعِ

فَاسْتَنْقَذْتُهَا مِنْهُمْ قَبْلَ أَنْ يَشْرَبُوا، فَأَقْبَلْتُ بِهَا أَسُوقُهَا، فَلَقِيَنِي النَّبِيُّ ﷺ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ، إِنَّ الْقَوْمَ عِطَاشٌ، وَإِنِّي أَعْجَلْتُهُمْ أَنْ يَشْرَبُوا سِقْيَهُمْ، فَابْعَثْ فِي إِثْرِهِمْ ، فَقَالَ «يَا ابْنَ الأَكْوَعِ، مَلَكْتَ فَأَسْجِحْ. إِنَّ الْقَوْمَ يُقْرَوْنَ فِي قَوْمِهِمْ». [رواه البخاري: ٣٠٤١]

**1298.** Rəvayət edilir ki, Sələmə ﷺ demişdir: "(Bir dəfə) mən Mədinədən çıxıb Ğabəyə[4] getdim. Nəhayət, Ğabəyə gedən yolun üstündəki dağ keçidinə çatdıqda Abdur-Rəhman ibn Aufun köləsinə rast gəldim. Mən (ondan) soruşdum: "Ay biçarə, nə olub sənə?" O dedi: "Peyğəmbərin ﷺ sağmal dəvələrini aparıblar." Mən: "Kim aparıb?"– deyə soruşdum. Dedi: "Ğətəfan və Fəzara (qəbiləsindən olan adamlar)." Mən o saat üç dəfə uca səslə: "Köməyə gəlin!"– deyə qışqırıb Mədinədəkiləri xəbərdar etdim. Sonra atımı dörd nala çapıb onlara çatdım və gördüm ki, onlar, həqiqətən də, Peyğəmbərin ﷺ sağmal dəvələrini götürmüşlər. Onda mən onları ox atəşinə tutdum və bu sözləri oxudum:

[1] Yəni bizimlə sizin aranızda gedən döyüş dəyişkəndir, gah siz bizə qalib gəlir, gah da biz sizə qalib gəlirik.
[2] Kəbənin içinə yerləşdirilmiş, Kinanə qəbiləsinin sitayiş etdiyi bütün adıdır.
[3] Bu, qadına bənzədilmiş bütün adıdır.
[4] 1027-ci hədisin qeydlərinə bax.

*Əkvanın oğluyam mən*
*Ölüm günüdür bu gün.*

Onlar (su) içməyə macal tapmamış mən dəvələri onların əlindən aldım və qabağıma qatıb Peyğəmbərin ﷺ yanına gətirdim. Yolda mən Peyğəmbərə ﷺ rast gəldim. Dedim: "Ya Rəsulullah, bu adamlar susamışlar, mən onlara su içməyə imkan verməyib başlarının üstünü aldım. (Məsləhətdirsə,) onların dalınca adam göndər." Peyğəmbər ﷺ dedi: "Ey Əkvanın oğlu, sən onları üstələdin. (İndi isə) mülayim davran. Həm də onlar artıq öz qəbilələrinə çatmışlar." (əl-Buxari, 3041)

## 78-ci fəsil. Əsirləri azad etmək

## ٧٨- باب: فَكَاكُ الأَسِيرِ

١٢٩٩ – عَنْ أَبِى مُوسَى رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «فُكُّوا الْعَانِىَ - يَعْنِى الأَسِيرَ - وَأَطْعِمُوا الْجَائِعَ وَعُودُوا الْمَرِيضَ». [رواه البخاري: ٣٠٤٦]

**1299.** Əbu Musa رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əsirləri azad edin, acların qarnını doydurun və xəstələrə baş çəkin!" (əl-Buxari, 3046)

١٣٠٠ – عَنْ أَبِى جُحَيْفَةَ رضي الله عنه قَالَ قُلْتُ لِعَلِىٍّ رضي الله عنه هَلْ عِنْدَكُمْ شَىْءٌ مِنَ الْوَحْىِ إِلاَّ مَا فِى كِتَابِ اللَّهِ قَالَ وَالَّذِى فَلَقَ الْحَبَّةَ وَبَرَأَ النَّسَمَةَ مَا أَعْلَمُهُ إِلاَّ فَهْمًا يُعْطِيهِ اللَّهُ رَجُلاً فِى الْقُرْآنِ، وَمَا فِى هَذِهِ الصَّحِيفَةِ. قُلْتُ وَمَا فِى الصَّحِيفَةِ قَالَ الْعَقْلُ وَفَكَاكُ الأَسِيرِ، وَأَنْ لاَ يُقْتَلَ مُسْلِمٌ بِكَافِرٍ. [رواه البخاري: ٣٠٤٧]

**1300.** Rəvayət edilir ki, Əbu Cuheyfə demişdir: "Mən Əlidən soruşdum: "Siz Allahın Kitabında olanlardan başqa qeyb xəbərlərindən bir şey bilirsinizmi?" Əli dedi: "Toxumu çatladıb cücərdən və insanı yaradan Allaha and olsun ki, mənim bildiyim ancaq Allahın insana Qurandan öyrətdikləri və bu səhifələrdə yazılanlardır." Mən: "Səhifələrdə nə yazılmışdır?"– deyə soruşdum. Dedi: "Qanbahasını ödəmək, əsirləri azad etmək və kafirə görə müsəlmanı öldürməmək." (əl-Buxari, 3047)

## 79-cu fəsil. Müşrikləri fidyə müqabilində azad etmək

## ٧٩- باب: فِدَاءُ الْمُشْرِكِينَ

١٣٠١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه أَنَّ رِجَالاً مِنَ الأَنْصَارِ اسْتَأْذَنُوا رَسُولَ اللَّهِ ﷺ فَقَالُوا يَا رَسُولَ اللَّهِ ائْذَنْ فَلْنَتْرُكْ لاِبْنِ أُخْتِنَا عَبَّاسٍ فِدَاءَهُ. فَقَالَ: «لاَ تَدَعُونَ مِنْهَا دِرْهَمًا». [رواه البخاري: ٣٠٤٨]

**1301.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, ənsardan olan (bəzi) adamlar Peyğəmbərdən ﷺ izn istəyib dedilər: "Ya Rəsulullah, izn ver, bacımız oğlu Abbasa görə verilmiş fidyəni[1] götürməyək." Peyğəmbər ﷺ buyurdu: "(Onun azad edilməsi üçün verilmiş) fidyədən bir dirhəm də olsun belə saxlamayın!" (əl-Buxari, 3048)

[1] 269-cu hədisin qeydlərinə bax.

**80-cı fəsil. İslama qarşı vuruşan adamın** (təhlükəsizliyinə dair) **zəmanət almadan müsəlman ölkəsinə daxil olması**

٨٠– باب:
**الْحَرْبِىُّ إِذَا دَخَلَ دَارَ الإِسْلاَمِ بِغَيْرِ أَمَانٍ**

١٣٠٢ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ قَالَ: أَتَى النَّبِىَّ ﷺ عَيْنٌ مِنَ الْمُشْرِكِينَ وَهُوَ فِى سَفَرٍ، فَجَلَسَ عِنْدَ أَصْحَابِهِ يَتَحَدَّثُ ثُمَّ انْفَتَلَ، فَقَالَ النَّبِىُّ ﷺ: «اطْلُبُوهُ وَاقْتُلُوهُ». فَقَتَلَهُ فَنَفَّلَهُ سَلَبَهُ. [رواه البخاري: ٣٠٥١]

**1302.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ﷺ demişdir: "Peyğəmbər ﷺ səfərdə olarkən müşriklərdən bir casus onun yanına gəldi. Həmin adam Peyğəmbərin ﷺ əshabələri ilə oturub bir qədər söhbət etdikdən sonra çıxıb getdi. Onda Peyğəmbər ﷺ buyurdu: "Tutun, öldürün onu!"

Sələmə onu öldürdü və Peyğəmbər ﷺ (ölmüş müşrikin) malını Sələməyə verdi. (əl-Buxari, 3051)

**81-ci fəsil. Nümayəndələrə hədiyyələr vermək**
**82-ci fəsil. Zimmilərə[1] havadarlıq etmək və onlarla iş görmək olarmı?**

**٨١– باب: جَوَائِزُ الْوَفْدِ**
٨٢– باب:
**هَلْ يُسْتَشْفَعُ إِلَى أَهْلِ الذِّمَّةِ وَمُعَامَلَتِهِمْ**

١٣٠٣ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّهُ قَالَ يَوْمُ الْخَمِيسِ، وَمَا يَوْمُ الْخَمِيسِ ثُمَّ بَكَى حَتَّى خَضَبَ دَمْعُهُ الْحَصْبَاءَ فَقَالَ اشْتَدَّ بِرَسُولِ اللَّهِ ﷺ وَجَعُهُ يَوْمَ الْخَمِيسِ فَقَالَ: «ائْتُونِى بِكِتَابٍ أَكْتُبْ لَكُمْ كِتَابًا لَنْ تَضِلُّوا بَعْدَهُ أَبَدًا». فَتَنَازَعُوا وَلاَ يَنْبَغِى عِنْدَ نَبِىٍّ تَنَازُعٌ فَقَالُوا هَجَرَ رَسُولُ اللَّهِ ﷺ قَالَ: «دَعُونِى فَالَّذِى أَنَا فِيهِ خَيْرٌ مِمَّا تَدْعُونِى إِلَيْهِ». وَأَوْصَى عِنْدَ مَوْتِهِ بِثَلاَثٍ «أَخْرِجُوا الْمُشْرِكِينَ مِنْ جَزِيرَةِ الْعَرَبِ، وَأَجِيزُوا الْوَفْدَ بِنَحْوِ مَا كُنْتُ أُجِيزُهُمْ». وَنَسِيتُ الثَّالِثَةَ. [رواه البخاري: ٣٠٥٣]

**1303.** Rəvayət edilir ki, (bir dəfə) ibn Abbas ﷺ: "Cümə axşamı! Nədir cümə axşamı?!"– deyib ağladı və onun göz yaşları yerdəki daşların üstünə düşməyə başladı. Sonra dedi: "Cümə axşamı Peyğəmbərin ﷺ ağrıları şiddətləndi və o: "Mənə kağız gətirin, sizə elə bir yazı yazım[2] ki, ondan sonra heç vaxt haqq yoldan azmayasınız"– deyə buyurdu. (Həmin vaxt oradakılar) mübahisə etməyə başladılar, halbuki onun hüzurunda mübahisə etmək olmaz. Onlar dedilər: "Peyğəmbərin vəziyyəti ağırdır!" Peyğəmbər ﷺ dedi: "Məni rahat buraxın! Mənim olduğum hal sizin məni dəvət etdiyiniz şeylərdən daha xeyirlidir." Peyğəmbər ﷺ ölüm ayağında üç şeyi vəsiyyət etdi: "Müşrikləri ərəb yarımadasından çıxardın! Mən (nümayəndələrə) hədiyyə verdiyim kimi, siz də (yanınıza gələn) nümayəndələrə hədiyyələr verin!" Üçüncü (vəsiyyətini isə) unutmuşam." (əl-Buxari, 3053)

[1] 1079-cu hədisin fəslinin qeydlərinə bax.
[2] "Yazdırım" qəsd edilir.

## 83-cü fəsil. Uşaqlar İslama necə dəvət edilir?

## ٨٣- باب: كَيْفَ يُعْرَضُ الإِسْلاَمُ عَلَى الصَّبِيِّ؟

١٣٠٤ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: قَامَ النَّبِيُّ ﷺ فِى النَّاسِ فَأَثْنَى عَلَى اللَّهِ بِمَا هُوَ أَهْلُهُ، ثُمَّ ذَكَرَ الدَّجَّالَ فَقَالَ: «إِنِّى أُنْذِرُكُمُوهُ، وَمَا مِنْ نَبِيٍّ إِلاَّ قَدْ أَنْذَرَهُ قَوْمَهُ، لَقَدْ أَنْذَرَهُ نُوحٌ قَوْمَهُ، وَلَكِنْ سَأَقُولُ لَكُمْ فِيهِ قَوْلاً لَمْ يَقُلْهُ نَبِيٌّ لِقَوْمِهِ، تَعْلَمُونَ أَنَّهُ أَعْوَرُ وَأَنَّ اللَّهَ لَيْسَ بِأَعْوَرَ». [رواه البخاري: ٣٠٥٧]

**1304.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər camaatın arasında ayağa qalxıb Allaha – Ona layiq tərzdə təriflər dedikdən sonra dəccalı yada salıb dedi: "Mən sizi ondan xəbərdar edib çəkindirirəm. Elə bir peyğəmbər olmamışdır ki, ümmətini ondan çəkindirmiş olmasın. Nuh da öz ümmətini ondan çəkindirmişdir. Lakin mən dəccal barəsində sizə elə bir söz deyəcəyəm ki, (onu) heç bir peyğəmbər öz ümmətinə deməmişdir. Bilin ki, o, təkgözdür. Allah isə təkgöz deyildir." (əl-Buxari, 3057)

## 84-cü fəsil. İxtiyar sahibinin camaatın (sayını) yazdırması

## ٨٤- باب: كِتَابَةُ الإِمَامِ النَّاسَ

١٣٠٥ – عَنْ حُذَيْفَةَ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «اكْتُبُوا لِى مَنْ تَلَفَّظَ بِالإِسْلاَمِ مِنَ النَّاسِ». فَكَتَبْنَا لَهُ أَلْفًا وَخَمْسَمِائَةِ رَجُلٍ، فَقُلْنَا نَخَافُ وَنَحْنُ أَلْفٌ وَخَمْسُمِائَةٍ فَلَقَدْ رَأَيْتُنَا ابْتُلِينَا حَتَّى إِنَّ الرَّجُلَ لَيُصَلِّى وَحْدَهُ وَهُوَ خَائِفٌ. [رواه البخاري: ٣٠٦٠]

**1305.** Rəvayət edilir ki, Huzeyfə رضي الله عنه demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ: "Müsəlman olduğunu söyləyən kimsələri siyahıya alın!"– deyə buyurdu. Biz də min beş yüz nəfərin siyahısını tutduq. Sonra (öz-özümüzə) dedik: "Min beş yüz nəfər olduğumuz halda (müşriklərdən) qorxacağıq?!" Sonralar biz çox müsibətlər gördük, hətta elə olurdu ki, adam təkbaşına qıldığı namazı qorxa-qorxa qılırdı[1]". (əl-Buxari, 3060)

## 85-ci fəsil. Düşməni məğlub etdikdən sonra üç gün onların torpaqlarında qalmaq

## ٨٥- باب: مَنْ غَلَبَ الْعَدُوَّ فَأَقَامَ عَلَى عَرْصَتِهِمْ ثَلاَثًا

١٣٠٦ – عَنْ أَبِى طَلْحَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ كَانَ إِذَا ظَهَرَ عَلَى قَوْمٍ أَقَامَ بِالْعَرْصَةِ ثَلاَثَ لَيَالٍ. [رواه البخاري: ٣٠٦٥]

**1306.** Əbu Təlhə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ düşməni məğlub etdikdən sonra üç gecə ərsədə[2] qalardı. (əl-Buxari, 3065)

---

[1] Ehtimal edilir ki, o, bununla Osman ibn Əffanın رضي الله عنه xilafəti dövründə Kufənin əmiri olmuş Vəlid ibn Ukbəni və onun kimilərini qəsd edirmiş. Çünki Vəlid camaat namazını gecikdirərdi və ya onu lazımi qaydada qıldırmazdı. Elə bu səbəbdən də Allahdan qorxan dindarlar namazı gizlində qorxa-qorxa qılar, sonra da gəlib onun arxasında həmin namazı qılardılar ki, cəzalandırılmasınlar və ya ən azı qınanmasınlar. (Fəthul Bari, 9/298)

[2] Meydan, açıq yer, boş sahə, düzənlik.

## ٨٦- باب: إِذَا غَنِمَ الْمُشْرِكُونَ مَالَ الْمُسْلِمِ ثُمَّ وَجَدَهُ الْمُسْلِمُ

## 86-cı fəsil. Müşriklər bir müsəlmanın malını ələ keçirdikdən sonra həmin müsəlman öz malını tapsa (nə etməlidir?)

١٣٠٧ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: ذَهَبَ فَرَسٌ لَهُ، فَأَخَذَهُ الْعَدُوُّ، فَظَهَرَ عَلَيْهِ الْمُسْلِمُونَ فَرُدَّ عَلَيْهِ فِي زَمَنِ رَسُولِ اللَّهِ ﷺ، وَأَبَقَ عَبْدٌ لَهُ فَلَحِقَ بِالرُّومِ، فَظَهَرَ عَلَيْهِمُ الْمُسْلِمُونَ، فَرَدَّهُ عَلَيْهِ خَالِدُ بْنُ الْوَلِيدِ بَعْدَ النَّبِيِّ ﷺ. [رواه البخاري: ٣٠٦٧]

**1307.** Rəvayət edilir ki, ibn Ömərin (r.a.) atı qaçıb getmiş və düşmən tərəfindən ələ keçirilmişdi. Müsəlmanlar onları məğlub etdikdən sonra onun atı özünə qaytarıldı. Bu hadisə Peyğəmbərin ﷺ zamanında baş vermişdi. Növbəti dəfə onun bir köləsi qaçdı və gedib rumlulara qoşuldu. Müsəlmanlar onları məğlub etdikdən sonra Xalid ibn Vəlid onun köləsini özünə qaytardı." (Bu hadisə) Peyğəmbərin ﷺ vəfatından sonra (baş vermişdi). (əl-Buxari, 3067)

## ٨٧- باب: مَنْ تَكَلَّمَ بِالْفَارِسِيَّةِ وَالرَّطَانَةِ وَقَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَٱخْتِلَٰفُ أَلْسِنَتِكُمْ وَأَلْوَٰنِكُمْ﴾ وَقَالَ: ﴿وَمَآ أَرْسَلْنَا مِن رَّسُولٍ إِلَّا بِلِسَانِ قَوْمِهِۦ﴾

## 87-ci fəsil. Farsca və ya digər əcəm dilində danışan kimsə haqqında. Uca Allah buyurur: "...dillərinizin və rənglərinizin müxtəlifliyi də Onun dəlillərindəndir."[1] (Digər ayədə) buyurur: "Biz hər bir elçini ancaq öz xalqının dilində danışan göndərdik ki..."[2]

١٣٠٨ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: قُلْتُ يَا رَسُولَ اللَّهِ، ذَبَحْنَا بُهَيْمَةً لَنَا، وَطَحَنْتُ صَاعًا مِنْ شَعِيرٍ، فَتَعَالَ أَنْتَ وَنَفَرٌ، فَصَاحَ النَّبِيُّ ﷺ فَقَالَ: «يَا أَهْلَ الْخَنْدَقِ، إِنَّ جَابِرًا قَدْ صَنَعَ سُؤْرًا، فَحَيَّ هَلاً بِكُمْ». [رواه البخاري: ٣٠٧٠]

**1308.** Rəvayət edilir ki, Cabir ibn Abdullah (r.a.) demişdir: "Mən dedim: "Ya Rəsulullah, biz bir quzu kəsmişik və bir saa[3] arpa üyütmüşük[4]. Bir neçə adam götür, gəl (bizə)!" Peyğəmbər ﷺ (əshabələrini) ucadan səsləyib dedi: "Ey xəndək qazanlar, Cabir sur[5] hazırlayıb. Haydı gedək!" (əl-Buxari, 3070)

١٣٠٩ – عَنْ أُمِّ خَالِدٍ بِنْتِ خَالِدِ بْنِ سَعِيدٍ رضي الله عنها قَالَتْ: أَتَيْتُ رَسُولَ اللَّهِ ﷺ مَعَ أَبِي وَعَلَيَّ قَمِيصٌ أَصْفَرُ، قَالَ رَسُولُ اللَّهِ ﷺ: «سَنَهْ سَنَهْ». قَالَ عَبْدُ اللَّهِ وَهِيَ بِالْحَبَشِيَّةِ حَسَنَةٌ. قَالَتْ فَذَهَبْتُ أَلْعَبُ بِخَاتَمِ النُّبُوَّةِ، فَزَبَرَنِي

---

[1] "ər-Rum" surəsi, 22.
[2] "İbrahim" surəsi, 4.
[3] 152-ci hədisin qeydlərinə bax.
[4] Cabir (r.a.) Əhzab döyüşündən əvvəl xəndək qazılarkən Peyğəmbərin ﷺ hamıyla birgə işlədiyini və aclıqdan əziyyət çəkdiyini görəndə onu evinə qonaq çağırmışdı.
[5] "Sur" fars sözü olub qonaqlıq, ziyafət və yemək-içmək mənalarını ifadə edir.

أَبِي قَالَ رَسُولُ اللَّهِ ﷺ: «دَعْهَا». ثُمَّ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَبْلِي وَأَخْلِفِي، ثُمَّ أَبْلِي وَأَخْلِفِي، ثُمَّ أَبْلِي وَأَخْلِفِي». [رواه البخاري: ٣٠٧١]

**1309.** Rəvayət edilir ki, Ummu Xalid bint Xalid ibn Səd ﵂ demişdir: "(Bir dəfə) mən atamla birlikdə Peyğəmbərin ﷺ yanına gəldim. Əynimdə sarı rəngli bir paltar var idi. Peyğəmbər ﷺ (paltarı görəndə): "Sənəh! Sənəh!"– dedi. Bu da həbəş dilində: "Qəşəngdir, qəşəng!"– deməkdir. Sonra mən (əlimlə) onun peyğəmbərlik əlamətini qurdalamağa başladım. Atam üstümə qışqırıb məni kənara çəkdi. Peyğəmbər: "Dəymə uşağa!"– deyə buyurdu, sonra da əlavə edib dedi: "(Bu paltarı) köhnələnədək, bir də köhnələnədək, bir də köhnələnədək gey![1]" (əl-Buxari, 3071)

## 88-ci fəsil. Əmanətə xəyanət etmək. Uca Allah buyurur: "Əmanətə xəyanət edən kimsə Qiyamət günü xəyanət etdiyi şeylə gələr"[2]

## ٨٨– باب: الغُلُولُ وَ قَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَمَن يَغْلُلْ يَأْتِ بِمَا غَلَّ يَوْمَ ٱلْقِيَٰمَةِ﴾

١٣١٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَامَ فِينَا النَّبِيُّ ﷺ فَذَكَرَ الْغُلُولَ فَعَظَّمَهُ وَعَظَّمَ أَمْرَهُ قَالَ: «لاَ أُلْفِيَنَّ أَحَدَكُمْ يَوْمَ الْقِيَامَةِ عَلَى رَقَبَتِهِ شَاةٌ لَهَا ثُغَاءٌ عَلَى رَقَبَتِهِ فَرَسٌ لَهُ حَمْحَمَةٌ يَقُولُ يَا رَسُولَ اللَّهِ، أَغِثْنِي. فَأَقُولُ لاَ أَمْلِكُ لَكَ شَيْئًا، قَدْ أَبْلَغْتُكَ. وَعَلَى رَقَبَتِهِ بَعِيرٌ لَهُ رُغَاءٌ، يَقُولُ يَا رَسُولَ اللَّهِ أَغِثْنِي. فَأَقُولُ لاَ أَمْلِكُ لَكَ شَيْئًا، قَدْ أَبْلَغْتُكَ. وَعَلَى رَقَبَتِهِ صَامِتٌ، فَيَقُولُ يَا رَسُولَ اللَّهِ أَغِثْنِي. فَأَقُولُ لاَ أَمْلِكُ لَكَ شَيْئًا، قَدْ أَبْلَغْتُكَ. أَوْ عَلَى رَقَبَتِهِ رِقَاعٌ تَخْفِقُ، فَيَقُولُ يَا رَسُولَ اللَّهِ أَغِثْنِي. فَأَقُولُ لاَ أَمْلِكُ لَكَ شَيْئًا، قَدْ أَبْلَغْتُكَ». [رواه البخاري: ٣٠٧٣]

**1310.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bizim aramızda ayağa qalxıb əmanətə xəyanət etmək barəsində danışdı, bunun olduqca böyük günah olduğunu vurğulayıb dedi: "Qiyamət günü heç biriniz boynunda mələyən bir qoyunla və ya kişnəyən bir atla gəlib deməsin ki: "Ya Rəsulullah, mənə yardım et!" Mən (cavabımda ona): "Sənə heç bir şeylə yardım edə bilmərəm. Mən (Allahın hökmünü) sənə təbliğ etmişdim"– deyəcəyəm. Yaxud boynunda nərildəyən bir dəvə ilə gəlib deməsin ki: "Ya Rəsulullah, mənə yardım et!" Mən (cavabımda ona): "Sənə heç bir şeylə yardım edə bilmərəm. Mən sənə təbliğ etmişdim"– deyəcəyəm. Yaxud boynunda qızıl və gümüşlə gəlib deməsin ki: "Ya Rəsulullah, mənə yardım et!" Mən (cavabımda ona): "Sənə heç bir şeylə yardım edə bilmərəm. Mən sənə təbliğ etmişdim"– deyəcəyəm. Yaxud boynunda parıldayan bir paltarla gəlib deməsin ki: "Ya Rəsulullah, mənə yardım et!" Mən (cavabımda ona): "Sənə heç bir şeylə yardım edə bilmərəm. Mən sənə təbliğ etmişdim"– deyəcəyəm." (əl-Buxari, 3073)

---

[1] Duanın ərəbcədən transkripsiyası belədir: "Əbli və əxlifi, summə əbli və əxlifi, summə əbli və əxlifi!" Peyğəmbər ﷺ bu duanı etməklə qızcığaza uzun ömür sürməyi arzu etmişdir.

[2] "Ali-İmran" surəsi, 161.

## ٨٩– باب: الْقَلِيلُ مِنَ الْغُلُولِ

## 89-cu fəsil. İcazəsiz qənimətdən götürülmüş çüzi bir şeyin (hökmü)

١٣١١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو رضي الله عنهما قَالَ: كَانَ عَلَى ثَقَلِ النَّبِيِّ ﷺ رَجُلٌ يُقَالُ لَهُ كِرْكِرَةُ فَمَاتَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «هُوَ فِي النَّارِ». فَذَهَبُوا يَنْظُرُونَ إِلَيْهِ فَوَجَدُوا عَبَاءَةً قَدْ غَلَّهَا. [رواه البخاري: ٣٠٧٤]

**1311.** Rəvayət edilir ki, Abdullah ibn Amr رضي الله عنهما demişdir: "Peyğəmbərin ﷺ ağır əşyalarını daşıyan Kirkirə adlı bir köməkçisi var idi. O, vəfat etdikdə Peyğəmbər ﷺ dedi: "O, Cəhənnəm atəşindədir!" (Əshabələr) gedib ona baxdılar və (onun əşyaları arasında) qənimət mallarından çırpışdırdığı bir əba tapdılar". (əl-Buxari, 3074)

## ٩٠– باب: اسْتِقْبَالُ الْغُزَاةِ

## 90-cı fəsil. Döyüşçüləri qarşılamaq

١٣١٢ – عَنِ ابْنِ الزُّبَيْرِ رضي الله عنهما أَنَّهُ قَالَ لِابْنِ جَعْفَرٍ رضي الله عنهما: أَتَذْكُرُ إِذْ تَلَقَّيْنَا رَسُولَ اللَّهِ ﷺ أَنَا وَأَنْتَ وَابْنُ عَبَّاسٍ قَالَ نَعَمْ، فَحَمَلَنَا وَتَرَكَكَ. [رواه البخاري: ٣٠٨٢]

**1312.** Rəvayət edilir ki, bir dəfə ibn Zubeyr رضي الله عنهما ibn Cəfərə dedi: "Bizim – mənim, sənin və ibn Abbasın Peyğəmbəri ﷺ qarşılamağımız yadındadırmı?" O, dedi: "Bəli! O bizi tərkinə almış, səni isə yerdə buraxmışdı." (əl-Buxari, 3082)

١٣١٣ – عَنِ السَّائِبِ بْنِ يَزِيدَ رضي الله عنه قَالَ: ذَهَبْنَا نَتَلَقَّى رَسُولَ اللَّهِ ﷺ مَعَ الصِّبْيَانِ إِلَى ثَنِيَّةِ الْوَدَاعِ. [رواه البخاري: ٣٠٨٣]

**1313.** Rəvayət edilir ki, Saib ibn Yezid رضي الله عنه demişdir: "(Bir zaman) biz uşaqlarla birlikdə Peyğəmbəri ﷺ qarşılamaq üçün Vida təpəsinə getmişdik." (əl-Buxari, 3083)

## ٩١– باب: مَا يَقُولُ إِذَا رَجَعَ مِنَ الْغَزْوِ

## 91-ci fəsil. Döyüşdən qayıdarkən nə deyilməlidir

١٣١٤ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ مَقْفَلَهُ مِنْ عُسْفَانَ، وَرَسُولُ اللَّهِ ﷺ عَلَى رَاحِلَتِهِ، وَقَدْ أَرْدَفَ صَفِيَّةَ بِنْتَ حُيَيٍّ، فَعَثَرَتْ نَاقَتُهُ فَصُرِعَا جَمِيعًا، فَاقْتَحَمَ أَبُو طَلْحَةَ فَقَالَ يَا رَسُولَ اللَّهِ، جَعَلَنِي اللَّهُ فِدَاءَكَ. قَالَ: «عَلَيْكَ الْمَرْأَةَ». فَقَلَبَ ثَوْبًا عَلَى وَجْهِهِ وَأَتَاهَا، فَأَلْقَاهَا عَلَيْهَا وَأَصْلَحَ لَهُمَا مَرْكَبَهُمَا فَرَكِبَا، وَاكْتَنَفْنَا رَسُولَ اللَّهِ ﷺ، فَلَمَّا أَشْرَفْنَا عَلَى الْمَدِينَةِ قَالَ: «آيِبُونَ تَائِبُونَ عَابِدُونَ لِرَبِّنَا حَامِدُونَ». فَلَمْ يَزَلْ يَقُولُ ذَلِكَ حَتَّى دَخَلَ الْمَدِينَةَ. [رواه البخاري: ٣٠٨٥]

**1314.** Rəvayət edilir ki, Ənəs ibn Malik رضي الله عنه demişdir: "(Bir dəfə) biz Peyğəmbərlə ﷺ birlikdə Usfəndən qayıdarkən Peyğəmbər ﷺ dəvəsinə minmiş, Səfiyyə bint Huyeyyi[1] də tərkinə almışdı. Birdən dəvə büdrədi və onların hər ikisi yerə

[1] 243-cü hədisə bax.

yıxıldı. Əbu Təlhə dəvəsindən yerə sıçrayıb: "Ya Rəsulullah, atam-anam sənə qurban"– dedi. Peyğəmbər ﷺ: "Qadının qeydinə qal!"– dedi. Əbu Təlhə bürüncəyi üzünə tutdu və qadına yaxınlaşıb bürüncəyi onun üstünə atdıqdan sonra onların dəvəsini yola hazırladı. Hər ikisi dəvəyə mindikdən sonra biz Peyğəmbəri ﷺ əhatəmizə aldıq. Biz Mədinəyə yaxınlaşdıqda Peyğəmbər ﷺ dedi: "Biz geri dönənlər, tövbə edənlər, ibadət edənlər, Rəbbimizə həmd edənlərik![1]" O, Mədinəyə daxil olanadək bu duanı təkrar etdi. (əl-Buxari, 3085)

## 92-ci fəsil. Səfərdən qayıtdıqda namaz qılmaq

## ٩٢– باب: الصَّلاَةُ إِذَا قَدِمَ مِنْ سَفَرٍ

١٣١٥ – عَنْ كَعْبٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا قَدِمَ مِنْ سَفَرٍ ضُحًى دَخَلَ الْمَسْجِدَ، فَصَلَّى رَكْعَتَيْنِ قَبْلَ أَنْ يَجْلِسَ.
[رواه البخاري: ٣٠٨٨]

**1315.** Kəb ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ nə zaman səfərdən səhər açıldıqda[2] qayıdardısa, məscidə girib oturmamışdan əvvəl iki rükət namaz qılardı. (əl-Buxari, 3088)

---

[1] Transkripsiyası: Ayibunə, taibunə, abidunə, li Rabbinə hamidun!
[2] Burada Duha vaxtı – yəni təqribən gün çıxandan yarım saat sonra – nəzərdə tutulur

# ٥٧ – كِتَابُ الخُمُسِ

# 57 – Xums kitabı

## ١ – باب: فَرْضُ الخُمُسِ

## 1-ci fəsil. Xumsun[1] vacibliyi

١٣١٦ – عَنْ مَالِكِ بْنِ أَوْسِ بْنِ الْحَدَثَانِ قَالَ: بَيْنَا أَنَا جَالِسٌ فِى أَهْلِى حِينَ مَتَعَ النَّهَارُ، إِذَا رَسُولُ عُمَرَ بْنِ الْخَطَّابِ يَأْتِينِى فَقَالَ أَجِبْ أَمِيرَ الْمُؤْمِنِينَ. فَانْطَلَقْتُ مَعَهُ حَتَّى أَدْخُلَ عَلَى عُمَرَ، فَإِذَا هُوَ جَالِسٌ عَلَى رِمَالِ سَرِيرٍ، لَيْسَ بَيْنَهُ وَبَيْنَهُ فِرَاشٌ مُتَّكِئٌ عَلَى وِسَادَةٍ مِنْ أَدَمٍ، فَسَلَّمْتُ عَلَيْهِ ثُمَّ جَلَسْتُ فَقَالَ يَا مَالِ، إِنَّهُ قَدِمَ عَلَيْنَا مِنْ قَوْمِكَ أَهْلُ أَبْيَاتٍ، وَقَدْ أَمَرْتُ فِيهِمْ بِرَضْخٍ فَاقْبِضْهُ فَاقْسِمْهُ بَيْنَهُمْ. فَقُلْتُ يَا أَمِيرَ الْمُؤْمِنِينَ، لَوْ أَمَرْتَ بِهِ غَيْرِى. قَالَ اقْبِضْهُ أَيُّهَا الْمَرْءُ. فَبَيْنَا أَنَا جَالِسٌ عِنْدَهُ أَتَاهُ حَاجِبُهُ يَرْفَا فَقَالَ هَلْ لَكَ فِى عُثْمَانَ وَعَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ وَالزُّبَيْرِ وَسَعْدِ بْنِ أَبِى وَقَّاصٍ يَسْتَأْذِنُونَ قَالَ نَعَمْ. فَأَذِنَ لَهُمْ فَدَخَلُوا فَسَلَّمُوا وَجَلَسُوا، ثُمَّ جَلَسَ يَرْفَا يَسِيرًا ثُمَّ قَالَ هَلْ لَكَ فِى عَلِىٍّ وَعَبَّاسٍ قَالَ نَعَمْ. فَأَذِنَ لَهُمَا، فَدَخَلاَ فَسَلَّمَا فَجَلَسَا، فَقَالَ عَبَّاسٌ يَا أَمِيرَ الْمُؤْمِنِينَ، اقْضِ بَيْنِى وَبَيْنَ هَذَا. وَهُمَا يَخْتَصِمَانِ فِيمَا أَفَاءَ اللَّهُ عَلَى رَسُولِهِ ﷺ مِنْ بَنِى النَّضِيرِ. فَقَالَ الرَّهْطُ عُثْمَانُ وَأَصْحَابُهُ يَا أَمِيرَ الْمُؤْمِنِينَ، اقْضِ بَيْنَهُمَا وَأَرِحْ أَحَدَهُمَا مِنَ الآخَرِ. قَالَ عُمَرُ تَيْدَكُمْ، أَنْشُدُكُمْ بِاللَّهِ الَّذِى بِإِذْنِهِ تَقُومُ السَّمَاءُ وَالأَرْضُ، هَلْ تَعْلَمُونَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ «لاَ نُورَثُ مَا تَرَكْنَا صَدَقَةٌ». يُرِيدُ رَسُولُ اللَّهِ ﷺ نَفْسَهُ. قَالَ الرَّهْطُ قَدْ قَالَ ذَلِكَ. فَأَقْبَلَ عُمَرُ عَلَى عَلِىٍّ وَعَبَّاسٍ فَقَالَ أَنْشُدُكُمَا اللَّهَ، أَتَعْلَمَانِ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَدْ قَالَ ذَلِكَ قَالاَ قَدْ قَالَ ذَلِكَ. قَالَ عُمَرُ فَإِنِّى أُحَدِّثُكُمْ عَنْ هَذَا الأَمْرِ، إِنَّ اللَّهَ قَدْ خَصَّ رَسُولَهُ ﷺ فِى هَذَا الْفَىْءِ بِشَىْءٍ لَمْ يُعْطِهِ أَحَدًا غَيْرَهُ – ثُمَّ قَرَأَ ﴿وَمَآ أَفَآءَ ٱللَّهُ عَلَىٰ رَسُولِهِۦ مِنۡهُمۡ﴾ إِلَى قَوْلِهِ ﴿قَدِيرٌ﴾ – فَكَانَتْ هَذِهِ خَالِصَةً لِرَسُولِ اللَّهِ ﷺ. وَاللَّهِ مَا احْتَازَهَا دُونَكُمْ، وَلاَ اسْتَأْثَرَ بِهَا عَلَيْكُمْ قَدْ أَعْطَاكُمُوهُ، وَبَثَّهَا فِيكُمْ حَتَّى بَقِىَ مِنْهَا هَذَا الْمَالُ، فَكَانَ رَسُولُ اللَّهِ ﷺ يُنْفِقُ عَلَى أَهْلِهِ نَفَقَةَ سَنَتِهِمْ مِنْ هَذَا الْمَالِ، ثُمَّ يَأْخُذُ مَا بَقِىَ فَيَجْعَلُهُ مَجْعَلَ مَالِ اللَّهِ، فَعَمِلَ رَسُولُ اللَّهِ ﷺ بِذَلِكَ حَيَاتَهُ، أَنْشُدُكُمْ بِاللَّهِ هَلْ تَعْلَمُونَ ذَلِكَ قَالُوا نَعَمْ. ثُمَّ قَالَ لِعَلِىٍّ وَعَبَّاسٍ أَنْشُدُكُمَا بِاللَّهِ هَلْ تَعْلَمَانِ ذَلِكَ قَالَ عُمَرُ ثُمَّ تَوَفَّى اللَّهُ نَبِيَّهُ ﷺ فَقَالَ أَبُو بَكْرٍ أَنَا وَلِىُّ رَسُولِ اللَّهِ ﷺ. فَقَبَضَهَا أَبُو بَكْرٍ، فَعَمِلَ فِيهَا بِمَا عَمِلَ رَسُولُ اللَّهِ ﷺ، وَاللَّهُ يَعْلَمُ إِنَّهُ فِيهَا لَصَادِقٌ بَارٌّ رَاشِدٌ تَابِعٌ لِلْحَقِّ، ثُمَّ تَوَفَّى اللَّهُ أَبَا بَكْرٍ، فَكُنْتُ أَنَا وَلِىَّ أَبِى بَكْرٍ، فَقَبَضْتُهَا سَنَتَيْنِ مِنْ إِمَارَتِى، أَعْمَلُ فِيهَا بِمَا عَمِلَ رَسُولُ اللَّهِ ﷺ وَمَا عَمِلَ فِيهَا أَبُو بَكْرٍ، وَاللَّهُ يَعْلَمُ إِنِّى فِيهَا لَصَادِقٌ بَارٌّ رَاشِدٌ تَابِعٌ لِلْحَقِّ، ثُمَّ جِئْتُمَانِى تُكَلِّمَانِى وَكَلِمَتُكُمَا وَاحِدَةٌ، وَأَمْرُكُمَا وَاحِدٌ، جِئْتَنِى يَا عَبَّاسُ تَسْأَلُنِى نَصِيبَكَ مِنِ ابْنِ أَخِيكَ، وَجَاءَنِى هَذَا – يُرِيدُ عَلِيًّا – يُرِيدُ نَصِيبَ امْرَأَتِهِ مِنْ أَبِيهَا، فَقُلْتُ لَكُمَا إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «لاَ نُورَثُ مَا تَرَكْنَا صَدَقَةٌ». فَلَمَّا بَدَا لِى أَنْ أَدْفَعَهُ إِلَيْكُمَا قُلْتُ إِنْ شِئْتُمَا دَفَعْتُهَا إِلَيْكُمَا عَلَى أَنَّ عَلَيْكُمَا عَهْدَ اللَّهِ وَمِيثَاقَهُ لَتَعْمَلاَنِ فِيهَا بِمَا عَمِلَ فِيهَا رَسُولُ اللَّهِ ﷺ، وَبِمَا عَمِلَ فِيهَا أَبُو بَكْرٍ، وَبِمَا عَمِلْتُ فِيهَا مُنْذُ وَلِيتُهَا، فَقُلْتُمَا ادْفَعْهَا إِلَيْنَا. فَبِذَلِكَ دَفَعْتُهَا إِلَيْكُمَا، فَأَنْشُدُكُمْ بِاللَّهِ، هَلْ دَفَعْتُهَا إِلَيْهِمَا بِذَلِكَ قَالَ الرَّهْطُ نَعَمْ.

---

[1] Hərbi qənimətlərin beşdə bir hissəsi. Bu bir hissə yenə də beş hissəyə bölünür və sonra onun beşdə bir hissəsi müsəlman hökmdarının əlində qalır, qalan beşdə dörd hissə isə Quran bölgüsünə uyğun olaraq, Muhəmməd Peyğəmbərin ﷺ qohumları – Haşimin və Müttəlibin nəsli, yetimlər, kasıblar və ehtiyac içində olan müsafirlər arasında paylanır.

ثُمَّ أَقْبَلَ عَلَى عَلِيٍّ وَعَبَّاسٍ فَقَالَ أَنْشُدُكُمَا بِاللَّه هَلْ دَفَعْتُهَا إِلَيْكُمَا بِذَلِكَ قَالاَ نَعَمْ. قَالَ فَتَلْتَمِسَانِ مِنِّى قَضَاءً غَيْرَ ذَلِكَ فَوَاللَّهِ الَّذِى بِإِذْنِه تَقُومُ السَّمَاءُ وَالأَرْضُ، لاَ أَقْضِى فِيهَا قَضَاءً غَيْرَ ذَلِكَ، فَإِنْ عَجَزْتُمَا عَنْهَا فَادْفَعَاهَا إِلَىَّ، فَإِنِّى أَكْفِيكُمَاهَا. [رواه البخاري: ٣٠٩٤]

**1316.** Rəvayət edilir ki, Malik ibn Ovs ibn Hədəsan demişdir: "(Bir dəfə) günorta vaxtı mən evimdə ikən Ömər ibn Xəttabın göndərdiyi elçi yanıma gəlib dedi: "Möminlərin əmiri səni çağırır!" Mən onunla (Ömərin) yanına getdim. Mən Ömərin yanına daxil olduqda onun boş taxtın üstündə oturduğunu gördüm. Onun altına heç bir şey sərilməmişdi, özü də dəri yastığa söykənmişdi. Mən salam verib oturdum. Ömər dedi: "Ey Mali![1] Sənin həmqəbilələrindən bəziləri (öz ailələri ilə birlikdə) yanıma gəlib (məndən yardım istədilər) və mən (öz köməkçilərimə) onlara yardım etməyi tapşırdım. Götür bu yardımı, onların arasında paylaşdır!" Dedim: "Ey möminlərin əmiri, bəlkə, bu işi başqasına tapşırasan." Ömər dedi: "Ay adam, (sənə) bunu götür, (payla dedim)!" Mən Ömərin yanında ikən onun qapıçısı Yərfa gəlib dedi: "Osman, Abdur-Rəhman ibn Auf, Zubeyr və Səd ibn Əbu Vəqqas (yanına gəlmək üçün) izn istəyirlər, onlara izn verirsənmi?" Ömər: "Bəli!"- deyib onlara izn verdi. Onlar içəri daxil oldular və salam verib oturdular. Yərfa da bir qədər oturduqdan sonra (ayağa qalxıb) dedi: "Əli və Abbas izn istəyir, onlara izn verirsənmi?" Ömər: "Bəli!"- deyib onlara izn verdi. Onlar içəri daxil oldular və salam verib oturdular. Abbas dedi: "Ey möminlərin əmiri, mənimlə bunun arasında hökm ver." Onların mübahisəsi, Allahın Öz peyğəmbərinə ﷺ qənimət olaraq bəxş etdiyi Bənu-Nədir qəbiləsinin malları üstündə düşmüşdü. Osman və onunla gələnlər dedilər: "Ey möminlərin əmiri, onların arasında hökm ver, onları sakitləşdir!" Omər dedi: "Özünüzü ələ alın! Göyü və yeri saxlayan Allah xatirinə (deyin görüm), Peyğəmbərin ﷺ, özünü qəsd edərək: "Biz (peyğəmbərlər) miras qoymuruq, qoyub getdiyimiz sədəqədir"- dediyini bilirsinizmi?" Onlar: "Bəli, demişdir"- deyə cavab verdilər. Sonra Omər Əliyə və Abbasa üz tutub soruşdu: "Sizi and verirəm Allaha (deyin görüm), Peyğəmbərin ﷺ belə dediyini bilirsinizmi?" Onlar: "Bəli, demişdir"- deyə cavab verdilər. Ömər dedi: "Mən sizə bu haqda xəbər vermək istəyirəm. Bilin ki, Allah bu qənimətləri məxsusi olaraq Öz elçisi üçün ayırmış və bundan heç kəsə pay verməmişdi." Sonra Ömər bu ayəni oxudu: "Allahın Öz Elçisinə onlardan verdiyi qənimətlərə tərəf siz nə at, nə də dəvə sürdünüz. Lakin Allah Öz elçilərini istədiyi kəslər üzərində hakim edir. Allah hər şeyə qadirdir."[2] Bu qənimətlər ancaq Allahın elçisinə məxsus idi. Amma bununla yanaşı vallahi, o, bu qənimətləri sizdən gizlin saxlayıb ancaq öz mənfəəti üçün istifadə etməmiş, (əksinə) bundan sizə pay ayırmış və onu sizin aranızda paylaşdırmışdı. Axıra da bu mübahisə etdiyiniz mallar qalmışdır. Peyğəmbər ﷺ bu maldan ailəsinin illik xərcini ödəyər, yerdə qalanını isə Allah yolunda xərclənən mallara qatardı. Peyğəmbər ﷺ ömrü boyu belə etmişdir. Allaha xatirinə (deyin görüm, Peyğəmbərin ﷺ) belə etdiyini bilirsinizmi?" Onlar: "Bəli!"- dedilər. Sonra Ömər Əliyə və Abbasa dedi: "Allaha xatirinə (deyin görüm,) bunu bilirsinizmi?" Sonra Ömər davam edib dedi: "Allah Öz

[1] "Mali" "Malik" isminin qısaldılmış formasıdır.
[2] "əl-Həşr" surəsi, 6.

peyğəmbərinin ﷺ dünyasını dəyişdikdən sonra Əbu Bəkr: “Mən Peyğəmbərin ﷺ xəlifəsiyəm”- deyib bu malları götürdü və onları Peyğəmbərin ﷺ sərf etdiyi işlərə sərf etdi. Allah bilir ki, Əbu Bəkr bu işdə sadiq, xeyirxah, doğru yolla gedən, haqqa boyun əyən bir adam idi. Allah Əbu Bəkrin ömrünü tamamladıqdan sonra mən Əbu Bəkrin varisi oldum və (xilafəti) idarə etdiyim iki il ərzində bu malları Peyğəmbərin ﷺ, sonra da Əbu Bəkrin sərf etdiyi işlərə sərf etdim. Allah bilir ki, mən bu işdə sadiq, xeyirxah, doğru yolla gedən, haqqa boyun əyən bir adam olmuşam. Sonra siz mənim yanıma gəldiniz və ikiniz də eyni sözü dediniz, eyni məsələni ərz etdiniz. Sən ey Abbas, gəlmisən, qardaşın oğlunun[1] (mirasından) sənə çatacaq payı götürəsən, bu (Əli) isə gəlib, zövcəsi üçün onun atasından qalmış mirası alsın. Mən də sizə dedim ki: “Peyğəmbər ﷺ demişdir: “Biz (peyğəmbərlər) miras qoymuruq, qoyub getdiyimiz sədəqədir!” Lakin düşünəndə ki, bu malları sizə vermək lazımdır, dedim: “İstəyirsinizsə, bu malları sizə verim, amma gərək siz bağladığınız əhdə, verdiyiniz sözə sadiq qalasınız və bu malları Peyğəmbərin ﷺ və Əbu Bəkrin sərf etdiyi, habelə mən xilafətə gəldikdən sonra sərf etdiyim işlərə sərf edəsiniz.” Siz: “Bu malları bizə ver!”- dediniz, buna görə də mən onları sizə verdim. Allah xatirinə deyin görüm, mən o malları sizə verdimmi?” Onlar: “Bəli!”- dedilər. Sonra o, üzünü Əliyə və Abbasa tərəf çevirib dedi: “Allah xatirinə deyin görüm, mən o malları sizə verdimmi?” Onlar: “Bəli!”- dedilər. Ömər dedi: “Yoxsa siz məndən başqa bir qərar gözləyirsiniz?! Göyü və yeri saxlayan Allaha and olsun ki, mən bu işdə başqa bir qərar verməyəcəyəm. Əgər siz bu malları yerbəyer edə bilməyəcəksinizsə, onda onları mənə qaytarın, mən bu işin öhdəsindən gələrəm.” (əl-Buxari, 3094)

## ٢ – باب: مَا ذُكِرَ مِنْ دِرْعِ النَّبِيِّ ﷺ وَعَصَاهُ وَسَيْفِهِ وَقَدَحِهِ وَخَاتَمِهِ، وَمَا اسْتَعْمَلَ الْخُلَفَاءُ بَعْدَهُ مِنْ ذَلِكَ مِمَّا لَمْ يُذْكَرْ قِسْمَتُهُ، وَمِنْ شَعَرِهِ وَنَعْلِهِ وَآنِيَتِهِ، مِمَّا يَتَبَرَّكُ أَصْحَابُهُ وَغَيْرُهُمْ بَعْدَ وَفَاتِهِ

## 2-ci fəsil. Peyğəmbərin ﷺ zirehi, əsası, qılıncı, qədəhi və üzüyü barəsində, habelə ondan sonra gələn xəlifələrin bu bölüşdürülməmiş əşyalardan istifadə etməsi barədə, həmçinin Peyğəmbərin ﷺ vəfatından sonra əshabələrinin və başqalarının onun saçı, səndəli və qabları vasitəsilə bərəkət diləməsi haqqında deyilənlər

١٣١٧ – عَنْ أَنَسٍ ﷺ أَنَّهُ أَخْرَجَ نَعْلَيْنِ جَرْدَاوَيْنِ قِبَالاَنِ، فَحَدَّثَ أَنَّهُمَا نَعْلاَ النَّبِيِّ ﷺ. [رواه البخاري: ٣١٠٧]

**1317.** Rəvayət edilir ki, (bir zaman) Ənəs ﷺ aşılanmamış dəridən tikilmiş, orta barmaqla adsız barmağa taxılan bağı olan bir cüt səndəl çıxardıb göstərmiş və onların Peyğəmbərə ﷺ məxsus olduğunu bildirmişdir. (əl-Buxari, 3107)

[1] Peyğəmbərin ﷺ atası Abdullah Abbasın ﷺ doğma qardaşı olmuşdur.

١٣١٨ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهَا أَخْرَجَتْ كِسَاءً مُلَبَّدًا وَقَالَتْ: فِى هَذَا نُزِعَ رُوحُ النَّبِىِّ ﷺ. وَفِي رِوَايَةٍ: أَنَّهَا رضي الله عنها أَخْرَجَتْ إِزَارًا غَلِيظًا مِمَّا يُصْنَعُ بِالْيَمَنِ، وَكِسَاءً مِنْ هَذِهِ الَّتِى يَدْعُونَهَا الْمُلَبَّدَةَ. [رواه البخاري: ٣١٠٨]

**1318.** Rəvayət edilir ki, (bir dəfə) Aişə ﵂ cod parçadan tikilmiş bir bürüncək çıxardıb demişdir: "Peyğəmbərin ﷺ ruhu bədənindən çıxarkən bu bürüncək onun əynində idi." Digər rəvayətdə, Aişənin Yəməndə hazırlanan, qalın parçadan tikilmiş bir izar[1] və cod parçadan tikilmiş bir bürüncək çıxartdığı xəbər verilmişdir." (əl-Buxari, 3108)

١٣١٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه أَنَّ قَدَحَ النَّبِىِّ ﷺ انْكَسَرَ، فَاتَّخَذَ مَكَانَ الشَّعْبِ سِلْسِلَةً مِنْ فِضَّةٍ. [رواه البخاري: ٣١٠٩]

**1319.** Ənəs ﵁ rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbərin piyaləsi sındı və o, bu qabın çatını gümüş lehimlə[2] yapışdırdı. (əl-Buxari, 3109)

## ٣– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿فَأَنَّ لِلَّهِ خُمُسَهُۥ وَلِلرَّسُولِ﴾

## 3-cü fəsil. Uca Allah buyurur: "...bilin ki, ələ keçirdiyiniz qənimətlərin beşdə biri Allaha, Onun Elçisinə.... məxsusdur..."[3]

١٣٢٠ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ الأَنْصَارِىِّ رضي الله عنهما قَالَ: وُلِدَ لِرَجُلٍ مِنَّا غُلاَمٌ فَسَمَّاهُ الْقَاسِمَ فَقَالَتِ الأَنْصَارُ لاَ نَكْنِيكَ أَبَا الْقَاسِمِ وَلاَ نُنْعِمُكَ عَيْنًا، فَأَتَى النَّبِىَّ ﷺ فَقَالَ يَا رَسُولَ اللَّهِ وُلِدَ لِى غُلاَمٌ، فَسَمَّيْتُهُ الْقَاسِمَ فَقَالَتِ الأَنْصَارُ لاَ نَكْنِيكَ أَبَا الْقَاسِمِ وَلاَ نُنْعِمُكَ عَيْنًا. فَقَالَ النَّبِىُّ ﷺ: «أَحْسَنَتِ الأَنْصَارُ، سَمُّوا بِاسْمِى، وَلاَ تَكَنَّوْا بِكُنْيَتِى، فَإِنَّمَا أَنَا قَاسِمٌ». [رواه البخاري: ٣١١٥]

**1320.** Rəvayət edilir ki, Cabir ibn Abdullah əl-Ənsari ﵄ demişdir: "Bizlərdən birinin oğlu oldu və o, uşağa Qasım adını verdi. Ənsar (ona) dedi: "Biz səni Əbul Qasım deyib çağırmayacaq və sənə gözün aydın olsun da deməyəcəyik." Onda həmin adam Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, mənim oğlum oldu və mən ona Qasım adını verdim. Lakin Ənsar (mənə) dedi ki: "Biz səni Əbul Qasım deyib çağırmayacaq və sənə gözün aydın olsun da deməyəcəyik." Peyğəmbər ﷺ buyurdu: "Ənsar düz iş görmüşdür. (Özünüzə) mənim adımı qoya bilərsiniz, lakin kunyamı[4] qoymayın. Çünki Qasım[5] ancaq mənəm!" (əl-Buxari, 3115)

١٣٢١ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «مَا أُعْطِيكُمْ وَلاَ أَمْنَعُكُمْ، أَنَا قَاسِمٌ أَضَعُ حَيْثُ أُمِرْتُ». [رواه البخاري: ٣١١٧]

---

[1] 239-cu hədisin qeydlərinə bax.
[2] Metal və başqa şeyləri yapışdırmaq üçün qalay və s. ərinti.
[3] "əl-Ənfal" surəsi, 41.
[4] 92-ci hədisin qeydlərinə bax.
[5] "Qasım" – bölüşdürən, paylaşdıran. Peyğəmbər ﷺ demək istəmişdir ki, o, nə isə verdikdə və ya imtina etdikdə bunu ancaq Allahın izni və istəyi ilə edir.

**1321.** Əbu Hureyra ﷛ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Mən öz ixtiyarımla) sizə nə (bir şey) əta edir, nə də verilən bir şeyə mane ola bilirəm. Mən ancaq bölüşdürənəm, mənə əmr olunanı yerinə eytirirəm." (əl-Buxari, 3117)

١٣٢٢ – عَنْ خَوْلَةَ الأَنْصَارِيَّةِ ﵂ قَالَتْ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «إِنَّ رِجَالاً يَتَخَوَّضُونَ فِي مَالِ اللَّهِ بِغَيْرِ حَقٍّ، فَلَهُمُ النَّارُ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٣١١٨]

**1322.** Rəvayət edilir ki, Xövlə əl-Ənsariyyə ﵂ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Elə insanlar vardır ki, onlar Allahın malını[1] haqsız yerə dağıdırlar. Belələrini Qiyamət günündə Cəhənnəm odu gözləyir." (əl-Buxari, 3118)

## 4-cü fəsil. Peyğəmbərin ﷺ: ﴿Qənimətlər sizə halal edildi!﴾ sözü

## ٤ – باب: قَوْلُ النَّبِيِّ ﷺ: ﴿أُحِلَّتْ لَكُمُ الْغَنَائِمُ﴾

١٣٢٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷛ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «غَزَا نَبِيٌّ مِنَ الأَنْبِيَاءِ فَقَالَ لِقَوْمِهِ لاَ يَتْبَعْنِي رَجُلٌ مَلَكَ بُضْعَ امْرَأَةٍ وَهُوَ يُرِيدُ أَنْ يَبْنِيَ بِهَا وَلَمَّا يَبْنِ بِهَا، وَلاَ أَحَدٌ بَنَى بُيُوتًا وَلَمْ يَرْفَعْ سُقُوفَهَا، وَلاَ أَحَدٌ اشْتَرَى غَنَمًا أَوْ خَلِفَاتٍ وَهُوَ يَنْتَظِرُ وِلاَدَهَا. فَغَزَا فَدَنَا مِنَ الْقَرْيَةِ صَلاَةَ الْعَصْرِ أَوْ قَرِيبًا مِنْ ذَلِكَ فَقَالَ لِلشَّمْسِ إِنَّكِ مَأْمُورَةٌ وَأَنَا مَأْمُورٌ، اللَّهُمَّ احْبِسْهَا عَلَيْنَا. فَحُبِسَتْ، حَتَّى فَتَحَ اللَّهُ عَلَيْهِ، فَجَمَعَ الْغَنَائِمَ، فَجَاءَتْ – يَعْنِي النَّارَ – لِتَأْكُلَهَا، فَلَمْ تَطْعَمْهَا، فَقَالَ إِنَّ فِيكُمْ غُلُولاً، فَلْيُبَايِعْنِي مِنْ كُلِّ قَبِيلَةٍ رَجُلٌ. فَلَزِقَتْ يَدُ رَجُلٍ بِيَدِهِ فَقَالَ فِيكُمُ الْغُلُولُ. فَلْتُبَايِعْنِي قَبِيلَتُكَ، فَلَزِقَتْ يَدُ رَجُلَيْنِ أَوْ ثَلاَثَةٍ بِيَدِهِ فَقَالَ فِيكُمُ الْغُلُولُ، فَجَاءُوا بِرَأْسٍ مِثْلِ رَأْسِ بَقَرَةٍ مِنَ الذَّهَبِ فَوَضَعُوهَا، فَجَاءَتِ النَّارُ فَأَكَلَتْهَا، ثُمَّ أَحَلَّ اللَّهُ لَنَا الْغَنَائِمَ، رَأَى ضَعْفَنَا وَعَجْزَنَا فَأَحَلَّهَا لَنَا». [رواه البخاري: ٣١٢٤]

**1323.** Əbu Hureyra ﷛ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Peyğəmbərlərdən biri döyüşə çıxarkən öz həmqəbilələrinə: "Qoy qadınla evlənib onunla yaxınlıq etmək istəyən, lakin hələ yaxınlıq etməmiş, həmçinin ev tikmiş, amma üstünü hələ damla örtməmiş, habelə qoyun və ya dəvə sürüsü almış və onların balalamasını gözləyən kimsələr mənim dalımca gəlməsinlər!"- dedi, sonra da döyüşə yollandı. O, əsr namazının vaxtında və ya buna yaxın bir vaxtda (qəsdinə durduğu) məmləkətə gəlib çatdıqda günəşə dedi: "Sən də (Allahın) əmrindəsən, mən də. Allahım, bizim üçün günəşi saxla!" Beləliklə, Allah Öz peyğəmbərinə zəfər bəxş edənədək günəş dayandı. Sonra o, (döyüşdə ələ keçirdikləri) qənimətləri bir yerə topladı. Bu vaxt (göydən) qənimətləri yandırıb yox edəcək bir od gəldi, lakin qənimətlərə toxunmadı[2]. Onda həmin

[1] Yəni Allahın müsəlmanlara bəxş etdiyi nemətləri, beytülmalı

[2] Muhəmməd peyğəmbərə ﷺ qədər gəlib getmiş peyğəmbərlər döyüşlərdə qənimət ələ keçirdikdə onu bir yerə toplayar, sonra da Allah göydən od nazil edib həmin qənimətləri yandırardı. Bu da onu bildirərdi ki, artıq onların Allah yolunda verdiyi qurbanlar qəbul edilmiş və qənimətlərdən heç bir şey mənimsənilməmişdir. Onu da qeyd etmək lazımdır ki, qənimətlərə yiyələnmək ancaq Muhəmməd ﷺ ümmətinə məxsus edilmişdir.

peyğəmbər (öz əsgərlərinə) dedi: "Aranızda əmanətə xəyanət edən kimsələr var. Odur ki, qoy hər qəbilədən bir nəfər mənə beyət etsin." (Beyət əsnasında) onlardan birinin əli peyğəmbərin əlinə yapışdı və o dedi: "Xəyanətkar sizin aranızdadır. Qoy sənin həmqəbilələrin mənə beyət etsinlər." (Bu dəfə) onlardan iki və ya üç nəfərin əli peyğəmbərin əlinə yapışdı və o dedi: "Xəyanəti siz etmişsiniz!" (İşin üstü açıldıqdan) sonra onlar gedib qızıldan düzəldilmiş, inək başına oxşar bir baş gətirdilər və onu (qənimətlərin arasına) qoydular. Bundan sonra od o qənimətlərin hamısını yandırıb yox etdi. Daha sonra isə Allah qənimətləri bizə halal buyurdu, bizim zəif və aciz olduğumuzu görüb onları bizə halal etdi[1]. (əl-Buxari, 3124)

## 5-ci fəsil

## ٥ – باب

١٣٢٤ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ بَعَثَ سَرِيَّةً فِيهَا عَبْدُ اللَّهِ قِبَلَ نَجْد، فَغَنِمُوا إِبِلاً كَثِيرًا، فَكَانَتْ سِهَامُهُمُ اثْنَىْ عَشَرَ بَعِيرًا أَوْ أَحَدَ عَشَرَ بَعِيرًا، وَنُفِّلُوا بَعِيرًا بَعِيرًا. [رواه البخاري: ٣١٣٤]

**1324.** İbn Ömərdən رضي الله عنهما rəvayət edilmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ Abdullah ibn Öməri ordu sıralarında Nəcdə yolladı. Orada onlar qənimət olaraq çoxlu dəvə ələ keçirdilər və hər bir döyüşçünün payına on iki və ya on bir dəvə düşdü. (Bundan əlavə,) onların hər birinə yenə bir dəvə verildi. (əl-Buxari, 3134)

١٣٢٥ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: بَيْنَمَا رَسُولُ اللَّهِ ﷺ يَقْسِمُ غَنِيمَةً بِالْجِعْرَانَةِ إِذْ قَالَ لَهُ رَجُلٌ اعْدِلْ. فَقَالَ لَهُ: «شَقِيتَ إِنْ لَمْ أَعْدِلْ». [رواه البخاري: ٣١٣٨]

**1325.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Ciranədə[2] qənimətləri bölüşdürərkən bir nəfər ona: "Ədalətlə (böl)!"– dedi. Peyğəmbər ﷺ ona dedi: "Mən ədalətli olmasaydım, sən bədbəxt olardın!" (əl-Buxari, 3138)

١٣٢٦ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما: أَنَّ عُمَرَ بْنَ الْخَطَّابِ رضي الله عنه قَالَ: يَا رَسُولَ اللَّهِ إِنَّهُ كَانَ عَلَيَّ اعْتِكَافُ يَوْمٍ فِي الْجَاهِلِيَّةِ، فَأَمَرَهُ أَنْ يَفِيَ بِهِ. قَالَ وَأَصَابَ عُمَرُ جَارِيَتَيْنِ مِنْ سَبْيِ حُنَيْنٍ، فَوَضَعَهُمَا فِي بَعْضِ بُيُوتِ مَكَّةَ – قَالَ – فَمَنَّ رَسُولُ اللَّهِ ﷺ عَلَى سَبْيِ حُنَيْنٍ، فَجَعَلُوا يَسْعَوْنَ فِي السِّكَكِ فَقَالَ عُمَرُ يَا عَبْدَ اللَّهِ، انْظُرْ مَا هَذَا فَقَالَ مَنَّ رَسُولُ اللَّهِ ﷺ عَلَى السَّبْيِ. قَالَ اذْهَبْ فَأَرْسِلِ الْجَارِيَتَيْنِ. [رواه البخاري: ٣١٤٤]

**1326.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Ömər ibn Xəttab dedi: "Ya Rəsulullah, mən cahiliyyət dövründə bir gün etikaf[3] edəcəyimə nəzir etmişəm." Peyğəmbər ﷺ də ona nəzirini yerinə yetirməyi əmr etdi.

Huneyn döyüşündə ələ keçirilmiş cariyələrdən ikisi Ömərə çatmışdı. O da bu cariyələri Məkkədəki evlərindən birində sakin etmişdi. Peyğəmbər ﷺ Huneyn əsirlərini azad etdikdən sonra onlar küçələrdə gəzib-dolaşmağa başladılar. Bu vaxt Ömər (oğluna) dedi: "Ey Abdullah, bax gör nə olub?" İbn

[1] 224-cü hədisə bax.
[2] 779-cu hədisin qeydlərinə bax.
[3] 205-ci hədisin qeydlərinə bax.

Ömər dedi: "Peyğəmbər ﷺ əsirləri azad etmişdir." Onda Ömər buyurdu: "Get, (mənə verilmiş) cariyələri azad et!" (əl-Buxari, 3144)

## ٦– باب: مَنْ لَمْ يُخَمِّسِ الأَسْلاَبَ، وَمَنْ قَتَلَ قَتِيلاً فَلَهُ سَلَبُهُ مِنْ غَيْرِ أَنْ يُخَمِّسَ، وَحُكْمُ الإِمَامِ فِيهِ

## 6-cı fəsil. Ölən (müşrikin) malının beşdə bir hissəsi götürülmür, əksinə, malının hamısı onu öldürən adama çatır, və əmir sahibinin bu xüsusda verdiyi hökm

١٣٢٧ – عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ﷺ قَالَ: بَيْنَا أَنَا وَاقِفٌ فِى الصَّفِّ يَوْمَ بَدْرٍ فَنَظَرْتُ عَنْ يَمِينِى وَشِمَالِى فَإِذَا أَنَا بِغُلاَمَيْنِ مِنَ الأَنْصَارِ حَدِيثَةٍ أَسْنَانُهُمَا، تَمَنَّيْتُ أَنْ أَكُونَ بَيْنَ أَضْلَعَ مِنْهُمَا، فَغَمَزَنِى أَحَدُهُمَا فَقَالَ يَا عَمِّ، هَلْ تَعْرِفُ أَبَا جَهْلٍ قُلْتُ نَعَمْ، مَا حَاجَتُكَ إِلَيْهِ يَا ابْنَ أَخِى قَالَ أُخْبِرْتُ أَنَّهُ يَسُبُّ رَسُولَ اللَّهِ ﷺ، وَالَّذِى نَفْسِى بِيَدِهِ لَئِنْ رَأَيْتُهُ لاَ يُفَارِقُ سَوَادِى سَوَادَهُ حَتَّى يَمُوتَ الأَعْجَلُ مِنَّا. فَتَعَجَّبْتُ لِذَلِكَ، فَغَمَزَنِى الآخَرُ فَقَالَ لِى مِثْلَهَا، فَلَمْ أَنْشَبْ أَنْ نَظَرْتُ إِلَى أَبِى جَهْلٍ يَجُولُ فِى النَّاسِ، قُلْتُ أَلاَ إِنَّ هَذَا صَاحِبُكُمَا الَّذِى سَأَلْتُمَانِى. فَابْتَدَرَاهُ بِسَيْفَيْهِمَا فَضَرَبَاهُ حَتَّى قَتَلاَهُ، ثُمَّ انْصَرَفَا إِلَى رَسُولِ اللَّهِ ﷺ فَأَخْبَرَاهُ فَقَالَ: «أَيُّكُمَا قَتَلَهُ». قَالَ كُلُّ وَاحِدٍ مِنْهُمَا أَنَا قَتَلْتُهُ. فَقَالَ: «هَلْ مَسَحْتُمَا سَيْفَيْكُمَا». قَالاَ: لاَ. فَنَظَرَ فِى السَّيْفَيْنِ فَقَالَ: «كِلاَكُمَا قَتَلَهُ». سَلَبُهُ لِمُعَاذِ بْنِ عَمْرِو بْنِ الْجَمُوحِ. وَكَانَا مُعَاذَ ابْنَ عَفْرَاءَ وَمُعَاذَ بْنَ عَمْرِو بْنِ الْجَمُوحِ. [رواه البخاري: ٣١٤١]

**1327.** Rəvayət edilir ki, Abdur-Rəhman ibn Auf ﷺ demişdir: "Bədr döyüşündə mən (döyüşçülərin) cərgələrində ikən sağıma və soluma baxıb gördüm ki, yanımda ənsardan olan iki azyaşlı uşaq durub. Onda mən, qüvvətli adamların arasında olmağı təmənna etdim. Uşaqlardan biri məni dümsükləyib dedi: "Əmican, Əbu Cəhli tanıyırsanmı?" Dedim: "Bəli, (tanıyıram)! O sənin nəyinə lazımdır, qardaş oğlu?" Uşaq dedi: "Mənə deyiblər ki, o, Peyğəmbəri ﷺ söyür. Canım Əlində olan Allaha and olsun ki, əgər mən onu görsəm, ikimizdən əcəli daha yaxın olanı ölməyincə mən ondan əl çəkməyəcəyəm!" Mən uşağın bu sözünə heyrət etdim. O birisi də məni dümsükləyib eyni sözləri dedi. Az keçmədən mən Əbu Cəhlin camaat arasında vurnuxduğunu gördüm və (uşaqlara): "Soruşduğunuz adam bax budur!"- dedim. Onlar qılınclarını çəkib Əbu Cəhlin üstünə cumdular və onu öldürənədək qılıncladılar. Sonra Peyğəmbərin ﷺ yanına gedib bunu ona xəbər verdilər. Peyğəmbər ﷺ soruşdu: "Onu hansınız öldürdü?" Uşaqların hər biri: "Onu mən öldürdüm!"– dedi. Peyğəmbər ﷺ soruşdu: "Qılınclarınızın (qanını) silmisinizmi?" Onlar: "Xeyr!"– deyə cavab verdilər. Peyğəmbər onların qılınclarına baxıb dedi: "Onu hər ikiniz öldürdünüz. Lakin (Əbu Cəhlin) malı Muaz ibn Amr əl-Cəmuha[1] çatacaq."

Uşaqlardan birinin adı Muaz ibn Əfra, o birisininki isə Muaz ibn Amr əl-Cəmuh idi." (əl-Buxari, 3141)

---

[1] Muaz ibn Amr əl-Cəmuhun ﷺ qılıncındakı qan daha çox olduğundan Peyğəmbər ﷺ ona belə demişdir.

## 7-ci fəsil. Peyğəmbərin ﷺ qənimətin beşdə bir hissəsindən qəlbləri yenicə müsəlmanlığa isinişən kimsələrə və başqa adamlara verməsi

## ٧– باب: مَا كَانَ النَّبِيُّ ﷺ يُعْطِي الْمُؤَلَّفَةَ قُلُوبُهُمْ وَغَيْرَهُمْ مِنَ الْخُمُسِ وَنَحْوِهِ

١٣٢٨ – عَنْ أَنَسٍ ؓ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «إِنِّي أُعْطِي قُرَيْشًا أَتَأَلَّفُهُمْ، لأَنَّهُمْ حَدِيثُ عَهْدٍ بِجَاهِلِيَّةٍ». [رواه البخاري: ٣١٤٦]

**1328.** Ənəs ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən qureyşlilərə (hədiyyələr) verirəm ki, onların qəlbini (İslama) isinişdirim. Çünki onlar cahiliyyətdən təzə çıxıblar.” (əl-Buxari, 3146)

١٣٢٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ؓ أَنَّ نَاسًا مِنَ الأَنْصَارِ قَالُوا لِرَسُولِ اللَّهِ ﷺ حِينَ أَفَاءَ اللَّهُ عَلَى رَسُولِهِ ﷺ مِنْ أَمْوَالِ هَوَازِنَ مَا أَفَاءَ، فَطَفِقَ يُعْطِي رِجَالاً مِنْ قُرَيْشٍ الْمِائَةَ مِنَ الإِبِلِ فَقَالُوا يَغْفِرُ اللَّهُ لِرَسُولِ اللَّهِ ﷺ يُعْطِي قُرَيْشًا وَيَدَعُنَا، وَسُيُوفُنَا تَقْطُرُ مِنْ دِمَائِهِمْ قَالَ أَنَسٌ فَحُدِّثَ رَسُولُ اللَّهِ ﷺ بِمَقَالَتِهِمْ، فَأَرْسَلَ إِلَى الأَنْصَارِ، فَجَمَعَهُمْ فِي قُبَّةٍ مِنْ أَدَمٍ، وَلَمْ يَدْعُ مَعَهُمْ أَحَدًا غَيْرَهُمْ، فَلَمَّا اجْتَمَعُوا جَاءَهُمْ رَسُولُ اللَّهِ ﷺ فَقَالَ: «مَا كَانَ حَدِيثٌ بَلَغَنِي عَنْكُمْ». قَالَ لَهُ فُقَهَاؤُهُمْ أَمَّا ذَوُو آرَائِنَا يَا رَسُولَ اللَّهِ فَلَمْ يَقُولُوا شَيْئًا، وَأَمَّا أُنَاسٌ مِنَّا حَدِيثَةٌ أَسْنَانُهُمْ فَقَالُوا يَغْفِرُ اللَّهُ لِرَسُولِ اللَّهِ ﷺ يُعْطِي قُرَيْشًا وَيَتْرُكُ الأَنْصَارَ، وَسُيُوفُنَا تَقْطُرُ مِنْ دِمَائِهِمْ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنِّي أُعْطِي رِجَالاً حَدِيثٌ عَهْدُهُمْ بِكُفْرٍ، أَمَا تَرْضَوْنَ أَنْ يَذْهَبَ النَّاسُ بِالأَمْوَالِ وَتَرْجِعُونَ إِلَى رِحَالِكُمْ بِرَسُولِ اللَّهِ ﷺ، فَوَاللَّهِ مَا تَنْقَلِبُونَ بِهِ خَيْرٌ مِمَّا يَنْقَلِبُونَ بِهِ». قَالُوا بَلَى يَا رَسُولَ اللَّهِ قَدْ رَضِينَا. فَقَالَ لَهُمْ: «إِنَّكُمْ سَتَرَوْنَ بَعْدِي أُثْرَةً شَدِيدَةً، فَاصْبِرُوا حَتَّى تَلْقَوُا اللَّهَ وَرَسُولَهُ ﷺ عَلَى الْحَوْضِ». قَالَ أَنَسٌ فَلَمْ نَصْبِرْ. [رواه البخاري: ٣١٤٧]

**1329.** Rəvayət edilir ki, Ənəs ؓ demişdir: “Allah həvazinlilərin mallarını[1] qənimət olaraq Öz peyğəmbərinə ﷺ əta etdikdə o, qureyşlilərdən bəzisinə yüz dəvə hədiyyə etdi və (bunu görəndə) ənsardan bəziləri dedilər: “Allah Rəsulullahı ﷺ əfv etsin! Bizi buraxıb qureyşlilərə[2] (hədiyyə) verir. Halbuki qılınclarımızdan hələ də onların qanı damır.” Ənsarın dediklərini Peyğəmbərə ﷺ xəbər verdilər. Onda Peyğəmbər ﷺ onların dalınca adam göndərib onları dəridən düzəldilmiş bir çadırın içinə topladı və onlardan başqa heç kəsi ora buraxmadı. Hamısı (oraya) toplandıqdan sonra Peyğəmbər ﷺ onların yanına gəlib dedi: “Nə söhbətdir, sizin adınızdan danışırlar?” Onların elm əhli dedi: “Müdrik olanlarımıza gəlincə ya Rəsulullah, onlar heç nə deməyiblər. O ki qaldı cavanlarımıza, onlar deyiblər ki: “Allah Rəsulullahı ﷺ əfv etsin! Ənsarı qoyub qureyşlilərə (hədiyyə) verir. Halbuki qılınclarımızdan hələ də onların qanı damır.” Peyğəmbər ﷺ buyurdu: “Mən küfrdən təzəcə uzaqlaşmış adamlara (hədiyyələr) verirəm. Razı deyilsiniz ki, bu adamlar mal-dövlət aparsın, siz isə Allahın elçisi ilə bir yerdə geri qayıdasınız. Vallahi, sizin apardığınız onların apardığından daha xeyirlidir.” Onlar da: “Əlbəttə ki, razıyıq, ya

---

[1] Söhbət Huneyn döyüşündə ələ keçirilmiş qənimətlərdən gedir.
[2] Burada müşrik olmuş və bu hadisədən bir az öncə onlarla vuruşmuş kimsələr nəzərdə tutulur.

Rəsulullah!"– dedilər. Peyğəmbər ﷺ onlara dedi: "Məndən sonra siz çox məğmunluq[1] görəcəksiniz. Hovuzun başında Allaha və Onun elçisinə ﷺ qovuşanadək səbir edin."

Ənəs dedi: "Lakin biz səbir edə bilmədik." (əl-Buxari, 3147)

١٣٣٠ – عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ﷺ: أَنَّهُ بَيْنَا هُوَ مَعَ رَسُولِ اللَّهِ ﷺ وَمَعَهُ النَّاسُ مُقْبِلاً مِنْ حُنَيْنٍ عَلِقَتْ رَسُولَ اللَّهِ ﷺ الأَعْرَابُ يَسْأَلُونَهُ حَتَّى اضْطَرُّوهُ إِلَى سَمُرَةٍ، فَخَطِفَتْ رِدَاءَهُ، فَوَقَفَ رَسُولُ اللَّهِ ﷺ فَقَالَ: «أَعْطُونِى رِدَائِى، فَلَوْ كَانَ عَدَدُ هَذِهِ الْعِضَاهِ نَعَمًا لَقَسَمْتُهُ بَيْنَكُمْ، ثُمَّ لاَ تَجِدُونِى بَخِيلاً وَلاَ كَذُوبًا وَلاَ جَبَانًا». [رواه البخاري: ٣١٤٨]

**1330.** Rəvayət edilir ki, Cubeyr ibn Mutim ﷺ Peyğəmbərlə ﷺ və başqa adamlarla birlikdə Huneyndən qayıdarkən bədəvilər Peyğəmbərin ﷺ üstünə cumub (qənimətdən pay) istəməyə başladılar, hətta iş o yerə gəlib çatdı ki, onu sıxışdıraraq akasiya[2] ağacının altına saldılar. Bu vaxt Peyğəmbərin ﷺ bürüncəyi (ağacın budağına) ilişdi və o ayaq saxlayıb dedi: "Bürüncəyimi mənə verin! Əgər mənim bu kollar qədər mal-qaram olsaydı, hamısını sizin aranızda bölüşdürərdim və onda siz mənim xəsis, yalançı və qorxaq olmadığımı görərdiniz." (əl-Buxari, 3148)

١٣٣١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: كُنْتُ أَمْشِى مَعَ النَّبِىِّ ﷺ وَعَلَيْهِ بُرْدٌ نَجْرَانِىٌّ غَلِيظُ الْحَاشِيَةِ، فَأَدْرَكَهُ أَعْرَابِىٌّ فَجَذَبَهُ جَذْبَةً شَدِيدَةً، حَتَّى نَظَرْتُ إِلَى صَفْحَةِ عَاتِقِ النَّبِىِّ ﷺ قَدْ أَثَّرَتْ بِهِ حَاشِيَةُ الرِّدَاءِ مِنْ شِدَّةِ جَذْبَتِهِ، ثُمَّ قَالَ مُرْ لِى مِنْ مَالِ اللَّهِ الَّذِى عِنْدَكَ. فَالْتَفَتَ إِلَيْهِ، فَضَحِكَ ثُمَّ أَمَرَ لَهُ بِعَطَاءٍ. [رواه البخاري: ٣١٤٩]

**1331.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərlə ﷺ birlikdə yol gedirdim. Peyğəmbərin ﷺ əynində Nəcranda tikilmiş qalın haşiyəli bir bürüncək var idi. Bu vaxt bir bədəvi (arxadan gəlib) ona çatdı və onun bürüncəyindən tutub elə (bərk) dartdı ki, mən bürüncəyin Peyğəmbərin ﷺ çiyninə iz buraxdığını gördüm. Sonra bədəvi dedi: "Əmr ver, Allahın səndə olan malından mənə də versinlər." Peyğəmbər ﷺ ona tərəf çevrilib gülümsədi, sonra da (qənimətdən) ona bir şey verilməsini əmr etdi." (əl-Buxari, 3149)

١٣٣٢ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: لَمَّا كَانَ يَوْمُ حُنَيْنٍ آثَرَ النَّبِىُّ ﷺ أُنَاسًا فِى الْقِسْمَةِ، فَأَعْطَى الأَقْرَعَ بْنَ حَابِسٍ مِائَةً مِنَ الإِبِلِ، وَأَعْطَى عُيَيْنَةَ مِثْلَ ذَلِكَ، وَأَعْطَى أُنَاسًا مِنْ أَشْرَافِ الْعَرَبِ، فَآثَرَهُمْ يَوْمَئِذٍ فِى الْقِسْمَةِ. قَالَ رَجُلٌ وَاللَّهِ إِنَّ هَذِهِ الْقِسْمَةَ مَا عُدِلَ فِيهَا، وَمَا أُرِيدَ بِهَا وَجْهُ اللَّهِ. فَقُلْتُ وَاللَّهِ لأُخْبِرَنَّ النَّبِىَّ ﷺ. فَأَتَيْتُهُ فَأَخْبَرْتُهُ فَقَالَ: «فَمَنْ يَعْدِلُ إِذَا لَمْ يَعْدِلِ اللَّهُ وَرَسُولُهُ رَحِمَ اللَّهُ مُوسَى قَدْ أُوذِىَ بِأَكْثَرَ مِنْ هَذَا فَصَبَرَ». [رواه البخاري: ٣١٥٠]

**1332.** Rəvayət edilir ki, Abdulla (ibn Məsud) ﷺ demişdir: "Huneyn döyüşündən sonra Peyğəmbər ﷺ qənimətləri bölüşdürərkən bəzi adamlara üstünlük verdi. Belə ki, o, Əqra ibn Habisə yüz dəvə, Üyeynəyə də bir o qədərini, habelə ərəblərin əyan-əşrafına (çoxlu hədiyyə) verməklə həmin gün onları (digərlərindən) üstün tutdu. (Bundan narazı qalmış) bir nəfər dedi: "Vallahi ki, bu

[1] Zərər çəkmiş, uduzmuş, aldanmış, bir şeydən məhrum olmuş, əli çıxmış adamın halı.
[2] Ağ və sarı çiçəkləri olan ağac və ya kol bitki.

bölgüdə ədalətsizliyə yol verilmişdir və bu bölgü Allahın Üzünü diləmək məqsədilə həyata keçirilməmişdir." Mən (ona): "Vallahi, (bu haqda) Peyğəmbərə ﷺ xəbər verəcəyəm"- dedim, sonra da Peyğəmbərin ﷺ yanına gedib bunu ona bildirdim. Peyğəmbər ﷺ buyurdu: "Allah və Onun Rəsulu ədalətli olmasa, kim ədalətli ola bilər? Allah Musaya rəhmət eləsin! Ona bundan da artıq əziyyət verilmişdir, lakin o, səbir etmişdir." (əl-Buxari, 3150)

## 8-ci fəsil. Döyüş ərazisində ələ keçirilmiş yemək

## ٨– باب: مَا يُصِيبُ مِنَ الطَّعَامِ فِى أَرْضِ الْحَرْبِ

١٣٣٣ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: كُنَّا نُصِيبُ فِى مَغَازِينَا الْعَسَلَ وَالْعِنَبَ فَنَأْكُلُهُ وَلاَ نَرْفَعُهُ. [رواه البخاري: ٣١٥٤]

**1333.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Biz apardığımız döyüşlərdə bal və üzüm ələ keçirərkən onu (ehtiyat üçün) saxlamayıb dərhal yeyərdik." (əl-Buxari, 3154)

# ٥٨ – كِتَابُ الجِزْيَةِ

# 58 – Cizyə kitabı

## ١ – باب: الْجِزْيَةُ وَالْمُوَادَعَةُ مَعَ أَهْلِ الْحَرْبِ

## 1-ci fəsil. (Zimmilərdən[1] alınan) cizyə[2] və düşmən ölkələri ilə (müvəqqəti olaraq) barışığa gəlmək

١٣٣٤ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ ﷺ أَنَّهُ كَتَبَ إِلَى أَهْلِ الْبَصْرَةِ قَبْلَ مَوْتِهِ بِسَنَةٍ: فَرِّقُوا بَيْنَ كُلِّ ذِي مَحْرَمٍ مِنَ الْمَجُوسِ. وَلَمْ يَكُنْ عُمَرُ أَخَذَ الْجِزْيَةَ مِنَ الْمَجُوسِ. حَتَّى شَهِدَ عَبْدُ الرَّحْمَنِ بْنُ عَوْفٍ أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَخَذَهَا مِنْ مَجُوسِ هَجَرٍ. [رواه البخاري: ٣١٥٦-٣١٥٧]

**1334.** Rəvayət edilmişdir ki, Ömər ibn Xəttab ﷺ ölümündən bir il əvvəl Bəsrə əhlinə belə (bir məktub) yazmışdır: "Qohumlarınız arasında məcusilərlə[3] ailə qurmuş hər kəsin nikahını ləğv edin!"

(O da rəvayət edilmişdir ki): "Abdur-Rəhman ibn Auf Peyğəmbərin ﷺ Həcərdə yaşayan məcusilərindən cizyə aldığına şahidlik edənə qədər Ömər ibn Xəttab məcusilərdən cizyə almamışdır." (əl-Buxari, 3156-3157)

١٣٣٥ – عَنْ عَمْرِو بْنِ عَوْفٍ الأَنْصَارِيِّ ﷺ وَهُوَ حَلِيفٌ لِبَنِي عَامِرِ بْنِ لُؤَيٍّ وَكَانَ شَهِدَ بَدْرًا أَخْبَرَهُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ بَعَثَ أَبَا عُبَيْدَةَ بْنَ الْجَرَّاحِ إِلَى الْبَحْرَيْنِ يَأْتِي بِجِزْيَتِهَا، وَكَانَ رَسُولُ اللَّهِ ﷺ هُوَ صَالَحَ أَهْلَ الْبَحْرَيْنِ وَأَمَّرَ عَلَيْهِمُ الْعَلاَءَ بْنَ الْحَضْرَمِيِّ، فَقَدِمَ أَبُو عُبَيْدَةَ بِمَالٍ مِنَ الْبَحْرَيْنِ، فَسَمِعَتِ الأَنْصَارُ بِقُدُومِ أَبِي عُبَيْدَةَ فَوَافَتْ صَلاَةَ الصُّبْحِ مَعَ النَّبِيِّ ﷺ، فَلَمَّا صَلَّى بِهِمِ الْفَجْرَ انْصَرَفَ، فَتَعَرَّضُوا لَهُ، فَتَبَسَّمَ رَسُولُ اللَّهِ ﷺ حِينَ رَآهُمْ وَقَالَ: «أَظُنُّكُمْ قَدْ سَمِعْتُمْ أَنَّ أَبَا عُبَيْدَةَ قَدْ جَاءَ بِشَيْءٍ». قَالُوا أَجَلْ يَا رَسُولَ اللَّهِ. قَالَ: «فَأَبْشِرُوا وَأَمِّلُوا مَا يَسُرُّكُمْ، فَوَاللَّهِ لاَ الْفَقْرَ أَخْشَى عَلَيْكُمْ، وَلَكِنْ أَخْشَى عَلَيْكُمْ أَنْ تُبْسَطَ عَلَيْكُمُ الدُّنْيَا كَمَا بُسِطَتْ عَلَى مَنْ كَانَ قَبْلَكُمْ، فَتَنَافَسُوهَا كَمَا تَنَافَسُوهَا وَتُهْلِكَكُمْ كَمَا أَهْلَكَتْهُمْ». [رواه البخاري: ٣١٥٨]

**1335.** Bənu-Amir ibn Luey qəbiləsinin müttəfiqi olmuş və Bədr döyüşündə iştirak etmiş Amr ibn Auf əl-Ənsari ﷺ rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ Əbu Ubeydə ibn Cərrahı Bəhreynə cizyə yığmağa göndərdi. Peyğəmbər ﷺ bəhreynlilərlə sülh müqaviləsi bağlamışdı və Əla ibn Hədrəmini onlara əmir təyin etmişdi. Əbu Ubeydə bəhreynlilərdən aldığı cizyəni götürüb (Mədinəyə) gəldikdə ənsar onun qayıtdığını eşitdi və sübh namazını Peyğəmbərlə ﷺ birlikdə qılmaq üçün məscidə gəldi. Peyğəmbər ﷺ namazı qılıb qurtardıqdan sonra oradakılar ona yaxınlaşıb (cizyədən pay almaq istədiklərini öz baxışları ilə) hiss etdirdilər. Peyğəmbər ﷺ onları görəndə gülümsəyib dedi: "Güman edirəm ki, siz Əbu Ubeydənin əlidolu qayıtdığını eşitmisiniz." Onlar: "Elədir, ya Rəsulullah!"- deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: "Sevinin və sizi sevindirəcək şeylərə ümid bəsləyin! Vallahi, mən sizin yox-

---

[1] 1079-cu hədisin fəslinin qeydlərinə bax.

[2] 1042-ci hədisin qeydlərinə bax.

[3] Burada Ömər ﷺ zərdüşt dininə mənsub olan atəşpərəstləri qəsd edir.

sulluğa məruz qalacağınızdan qorxmuram. Lakin mən sizdən əvvəlkilərə gen-bol həyat nəsib edildiyi kimi, sizə də firavan bir həyat nəsib edilməsindən, bu səbəbdən də əvvəlkilər tək sizin də bir-birinizlə rəqabət aparmağınızdan və dünya malının onları məhv etdiyi kimi, sizi də məhv etməsindən qorxuram." (əl-Buxari, 3158)

١٣٣٦ – عَنْ جُبَيْرِ بْنِ حَيَّةَ قَالَ: بَعَثَ عُمَرُ ﷺ النَّاسَ فِى أَفْنَاءِ الأَمْصَارِ يُقَاتِلُونَ الْمُشْرِكِينَ، فَأَسْلَمَ الْهُرْمُزَانُ فَقَالَ إِنِّى مُسْتَشِيرُكَ فِى مَغَازِىَّ هَذِهِ. قَالَ نَعَمْ، مَثَلُهَا وَمَثَلُ مَنْ فِيهَا مِنَ النَّاسِ مِنْ عَدُوِّ الْمُسْلِمِينَ مَثَلُ طَائِرٍ لَهُ رَأْسٌ وَلَهُ جَنَاحَانِ وَلَهُ رِجْلاَنِ، فَإِنْ كُسِرَ أَحَدُ الْجَنَاحَيْنِ نَهَضَتِ الرِّجْلاَنِ بِجَنَاحٍ وَالرَّأْسُ، فَإِنْ كُسِرَ الْجَنَاحُ الآخَرُ نَهَضَتِ الرِّجْلاَنِ وَالرَّأْسُ، وَإِنْ شُدِخَ الرَّأْسُ ذَهَبَتِ الرِّجْلاَنِ وَالْجَنَاحَانِ وَالرَّأْسُ، فَالرَّأْسُ كِسْرَى، وَالْجَنَاحُ قَيْصَرُ، وَالْجَنَاحُ الآخَرُ فَارِسُ، فَمُرِ الْمُسْلِمِينَ فَلْيَنْفِرُوا إِلَى كِسْرَى. قَالَ فَنَدَبَنَا عُمَرُ وَاسْتَعْمَلَ عَلَيْنَا النُّعْمَانَ بْنَ مُقَرِّنٍ، حَتَّى إِذَا كُنَّا بِأَرْضِ الْعَدُوِّ، وَخَرَجَ عَلَيْنَا عَامِلُ كِسْرَى فِى أَرْبَعِينَ أَلْفًا، فَقَامَ تُرْجُمَانٌ فَقَالَ لِيُكَلِّمْنِى رَجُلٌ مِنْكُمْ. فَقَالَ الْمُغِيرَةُ سَلْ عَمَّا شِئْتَ. قَالَ مَا أَنْتُمْ قَالَ نَحْنُ أُنَاسٌ مِنَ الْعَرَبِ كُنَّا فِى شَقَاءٍ شَدِيدٍ وَبَلاَءٍ شَدِيدٍ، نَمَصُّ الْجِلْدَ وَالنَّوَى مِنَ الْجُوعِ، وَنَلْبَسُ الْوَبَرَ وَالشَّعَرَ، وَنَعْبُدُ الشَّجَرَ وَالْحَجَرَ، فَبَيْنَا نَحْنُ كَذَلِكَ، إِذْ بَعَثَ رَبُّ السَّمَوَاتِ وَرَبُّ الأَرَضِينَ تَعَالَى ذِكْرُهُ وَجَلَّتْ عَظَمَتُهُ إِلَيْنَا نَبِيًّا مِنْ أَنْفُسِنَا، نَعْرِفُ أَبَاهُ وَأُمَّهُ، فَأَمَرَنَا نَبِيُّنَا رَسُولُ رَبِّنَا ﷺ أَنْ نُقَاتِلَكُمْ حَتَّى تَعْبُدُوا اللَّهَ وَحْدَهُ أَوْ تُؤَدُّوا الْجِزْيَةَ، وَأَخْبَرَنَا نَبِيُّنَا ﷺ عَنْ رِسَالَةِ رَبِّنَا أَنَّهُ مَنْ قُتِلَ مِنَّا صَارَ إِلَى الْجَنَّةِ فِى نَعِيمٍ لَمْ يَرَ مِثْلَهَا قَطُّ، وَمَنْ بَقِىَ مِنَّا مَلَكَ رِقَابَكُمْ. فَقَالَ النُّعْمَانُ رُبَّمَا أَشْهَدَكَ اللَّهُ مِثْلَهَا مَعَ النَّبِىِّ ﷺ فَلَمْ يُنَدِّمْكَ وَلَمْ يُخْزِكَ، وَلَكِنِّى شَهِدْتُ الْقِتَالَ مَعَ رَسُولِ اللَّهِ ﷺ كَانَ إِذَا لَمْ يُقَاتِلْ فِى أَوَّلِ النَّهَارِ انْتَظَرَ حَتَّى تَهُبَّ الأَرْوَاحُ وَتَحْضُرَ الصَّلَوَاتُ. [رواه البخاري: ٣١٥٩-٣١٦٠]

**1336.** Rəvayət edilir ki, Cubeyr ibn Heyyə demişdir: "Ömər ﷺ müşriklərlə vuruşmaq üçün (müxtəlif) ölkələrə ordular göndərirdi. (Axırda) Hurmuzan[1] İslamı qəbul etdi və (Ömər ona) dedi: "Mən bu döyüşlərim barədə səninlə məşvərət etmək istəyirəm." Hurmuzan dedi: "Düzünə qalsa, döyüşdüyünüz bu ölkələrlə orada yaşayan və müsəlmanlara düşmən olan insanlar, bir başı, iki qanadı və iki ayağı olan quşa bənzəyir. Quşun qanadlarından biri qoparılsa belə, o, iki ayağı, bir qanadı və başı ilə (yenidən) dirçələr. O biri qanadı da qoparılarsa, ayaqları və başı (sayəsində) yaşamağa davam edər. Hərgah başını bədənindən ayırsanız, onda qanadlar da, ayaqlar da, baş da faydasız bir şeyə çevrilər. (Məlumun olsun ki, quşun) başı xosrovdur, qanadlarından biri qeysər,[2] digəri isə farslardır. Müsəlmanlara əmr et, xosrovun üstünə getsinlər!"

Bundan sonra Ömər ﷺ (qoşun yığıb) Noman ibn Müqərrini ﷺ bizə başçı təyin etdi və (bizi Xosrovun üstünə göndərdi). Nəhayət, biz gəlib düşmən torpağına çatdıqda xosrovun təyin etdiyi canişin[3] qırx minlik qoşunla qabağımıza çıxdı və (onların) tərcüməçisi qabağa çıxıb dedi: "Qoy aranızdan bir nəfər mənimlə danışığa gəlsin!" Muğira (irəli keçib) dedi: "Nə soruşmaq istəyirsənsə, soruş?" (Tərcüməçi): "Siz kimsiniz?"- deyə soruşdu. Muğira dedi: "Biz ərəb millətindənik. (İslamaqədərki dövrdə) biz olduqca acınacaqlı və

[1] Hurmuzan Huzistan əyalətinin canişini olmuş və İslamı qəbul etməmişdən əvvəl uzun illər müsəlmanlarla vuruşmuşdur.

[2] Xosrov fars şahlarının, qeysər isə rum imperatorlarının tituludur.

[3] Dövlətin vilayətlərindən birini və ya bir neçəsini padşah adından idarə edən və ali hakimiyyət hüquqlarına malik olan şəxs.

cansıxıcı həyat keçirərdik, acından dəri və xurma çərdəyi çeynəyərdik, yundan və tükdən paltar geyərdik, üstəlik ağaclara və daşlara sitayiş edərdik. Belə olduğumuz halda göylərin və yerlərin Rəbbi – şanı (hər şeydən) uca, əzəməti (hər şeydən) böyük olan (Allah) içərimizdən bizə atasını və anasını tanıdığımız bir peyğəmbər göndərdi. Peyğəmbərimiz – Allahın elçisi ﷺ bizə, siz Tək Allaha ibadət etməyincə və ya cizyə verməyincə sizinlə vuruşmağı əmr etdi. Peyğəmbərimiz ﷺ Rəbbimizin risalətindən[1] bizə xəbər verib demişdir ki, bizlərdən (Allah yolunda vuruşub) ölənlərimiz Cənnətə girəcək və bənzərini görmədiyi nemətlər içində olacaq, sağ qalanlarımız isə sizin üzərinizdə hökmranlıq edəcəkdir."

Bundan sonra Nomən (Muğiraya) dedi: "Əgər Allah sənə Peyğəmbərlə ﷺ birlikdə belə döyüşlərdə iştirak etməyi nəsib etmişsə, O, səni peşman və rüsvay etməz. Açığını desəm, mən Peyğəmbərlə ﷺ birlikdə bir çox döyüşlərdə iştirak etmişəm və (bilirəm ki,) o, gündüzün əvvəlində döyüşə başlamadığı təqdirdə küləyin əsməyini və (günortadan sonrakı) namazların vaxtının yetişməyini gözləyərdi." (əl-Buxari, 3160)

## ٢– باب: إِذَا وَادَعَ الإِمَامُ مَلِكَ الْقَرْيَةِ هَلْ يَكُونُ ذَلِكَ لِبَقِيَّتِهِمْ؟

## 2-ci fəsil. Ölkə başçısı digər bir məmləkətin başçısı ilə saziş bağladıqda (bu saziş) o yerin əhalisinin hamısına aid olurmu?

١٣٣٧ – عَنْ أَبِي حُمَيْدٍ السَّاعِدِيِّ ﷺ قَالَ: غَزَوْنَا مَعَ النَّبِيِّ ﷺ تَبُوكَ، وَأَهْدَى مَلِكُ أَيْلَةَ لِلنَّبِيِّ ﷺ بَغْلَةً بَيْضَاءَ، وَكَسَاهُ بُرْدًا، وَكَتَبَ لَهُ بِبَحْرِهِمْ. [رواه البخاري: ٣١٦١]

**1337.** Rəvayət edilir ki, Əbu Humeyd əs-Saidi ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Təbuka yürüş edərkən Əylə hökmdarı[2] Peyğəmbərə ﷺ bir ağ qatır və bir cübbə hədiyyə etdi. (Peyğəmbər ﷺ də) ona dənizin sahilində yaşayan əhalisi üçün (sülh müqaviləsi) yazıb göndərdi." (əl-Buxari, 3161)

## ٣– باب: إِثْمُ مَنْ قَتَلَ مُعَاهَدًا بِغَيْرِ جُرْمٍ

## 3-cü fəsil. Cinayət etməyən müahidi[3] öldürən kimsənin günahı

١٣٣٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ قَتَلَ مُعَاهَدًا لَمْ يَرَحْ رَائِحَةَ الْجَنَّةِ، وَإِنَّ رِيحَهَا تُوجَدُ مِنْ مَسِيرَةِ أَرْبَعِينَ عَامًا». [رواه البخاري: ٣١٦٦]

**1338.** Abdullah ibn Amr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bir müahidi öldürərsə, Cənnətin iyini duymaz. Halbuki onun iyi qırx illik məsafədən duyulur." (əl-Buxari, 3166)

---

[1] Burada Allahın nazil etdiyi vəhy nəzərdə tutulur.
[2] 754-cü hədisə və onun qeydlərinə bax.
[3] Bu sözün hərfi tərcüməsi "saziş başlayan tərəf" deməkdir. Burada isə İslamı qəbul etməyən, bağladığı saziş əsasında müsəlmanların ərazisində yaşayıb cizyə verən kafir nəzərdə tutulur.

## 4-cü fəsil. Müsəlmanlara xəyanət edən müşrikləri bağışlamaq olarmı?

## ٤ – باب: إِذَا غَدَرَ الْمُشْرِكُونَ بِالْمُسْلِمِينَ هَلْ يُعْفَى عَنْهُمْ؟

١٣٣٩ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ لَمَّا فُتِحَتْ خَيْبَرُ أُهْدِيَتْ لِلنَّبِيِّ ﷺ شَاةٌ فِيهَا سُمٌّ فَقَالَ النَّبِيُّ ﷺ: «اجْمَعُوا إِلَيَّ مَنْ كَانَ هَا هُنَا مِنْ يَهُودَ». فَجُمِعُوا لَهُ فَقَالَ: «إِنِّى سَائِلُكُمْ عَنْ شَيْءٍ فَهَلْ أَنْتُمْ صَادِقِيَّ عَنْهُ». فَقَالُوا نَعَمْ. قَالَ لَهُمُ النَّبِيُّ ﷺ: «مَنْ أَبُوكُمْ؟» قَالُوا فُلاَنٌ. فَقَالَ: «كَذَبْتُمْ، بَلْ أَبُوكُمْ فُلاَنٌ». قَالُوا صَدَقْتَ. قَالَ: «فَهَلْ أَنْتُمْ صَادِقِيَّ عَنْ شَيْءٍ إِنْ سَأَلْتُ عَنْهُ» فَقَالُوا نَعَمْ يَا أَبَا الْقَاسِمِ، وَإِنْ كَذَبْنَا عَرَفْتَ كَذِبَنَا كَمَا عَرَفْتَهُ فِى أَبِينَا. فَقَالَ لَهُمْ: «مَنْ أَهْلُ النَّارِ». قَالُوا نَكُونُ فِيهَا يَسِيرًا ثُمَّ تَخْلُفُونَا فِيهَا. فَقَالَ النَّبِيُّ ﷺ: «اخْسَئُوا فِيهَا، وَاللَّهِ لاَ نَخْلُفُكُمْ فِيهَا أَبَدًا – ثُمَّ قَالَ – هَلْ أَنْتُمْ صَادِقِيَّ عَنْ شَيْءٍ إِنْ سَأَلْتُكُمْ عَنْهُ». فَقَالُوا نَعَمْ يَا أَبَا الْقَاسِمِ. قَالَ: «هَلْ جَعَلْتُمْ فِى هَذِهِ الشَّاةِ سُمًّا». قَالُوا نَعَمْ. قَالَ: «مَا حَمَلَكُمْ عَلَى ذَلِكَ». قَالُوا أَرَدْنَا إِنْ كُنْتَ كَاذِبًا نَسْتَرِيحُ، وَإِنْ كُنْتَ نَبِيًّا لَمْ يَضُرَّكَ. [رواه البخاري: ٣١٦٩]

**1339.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Xeybər fəth edildikdə Peyğəmbərə ﷺ (qızardılmış və ətinə) zəhər qatılmış bir qoyun gətirdilər. (Peyğəmbər ﷺ ətdən yedikdən sonra əshabələrinə): "Burada yaşayan yəhudilərin hamısını yanıma toplayın!"- deyə buyurdu. Əshabələr yəhudiləri (Peyğəmbərin ﷺ) yanına cəm etdikdə o dedi: "Mən sizdən söz soruşmaq istəyirəm. Mənə düzgün cavab verəcəksinizmi?" Onlar: "Bəli!"- dedilər. Peyğəmbər ﷺ onlardan: "Atanız kimdir?"- deyə soruşdu. Onlar: "Filankəsdir"- deyə cavab verdilər. (Peyğəmbər ﷺ onlara): "Yalan danışdınız, sizin atanız filankəsdir"- dedi. Onlar: "Doğru söylədin"- dedilər. O (yenə) dedi: "Mən sizdən bir söz soruşsam, mənə düzgün cavab verəcəksinizmi?" Onlar dedilər: "Bəli, ey Əbul Qasım! Hərgah yalan danışsaq, atamız barəsində yalan danışdığımız (sənə agah olduğu) kimi, bu da sənə agah olacaq." (Peyğəmbər ﷺ) onlardan: "Kimlər Cəhənnəm oduna düşəcək?"- deyə soruşdu. Onlar dedilər: "Biz orada az bir müddət qalacaq, sonra isə siz bizim yerimizi tutacaqsınız." Peyğəmbər ﷺ dedi: "Orada zəlil və məyus halda durub qalın! Biz əsla sizin yerinizi tutmayacağıq!" Sonra (yenə) soruşdu: "Mən sizə bir sual versəm, mənə düzgün cavab verəcəksinizmi?" Onlar: "Bəli, ey Əbul Qasım!"- deyə cavab verdilər. (Peyğəmbər ﷺ) soruşdu: "Siz bu qoyunun ətinə zəhər qatmısınızmı?" Onlar: "Bəli!"- dedilər. (Peyğəmbər ﷺ) soruşdu: "Sizi bu işi görməyə nə vadar etdi?" Onlar dedilər: "(Yoxlamaq) istəyirdik görək, əgər yalançısansa, səndən canımız qurtaracaq, yox əgər peyğəmbərsənsə, onda bu zəhərin sənə zərəri dəyməyəcək." (əl-Buxari, 3169)

## 5-ci fəsil. Pul və başqa şeylər müqabilində müşriklərlə barışmaq və onlarla saziş bağlamaq, və əhdi pozan kimsənin günahı

## ٥ – باب: الْمُوَادَعَةُ وَالْمُصَالَحَةُ مَعَ الْمُشْرِكِينَ بِالْمَالِ وَغَيْرِهِ، وَإِثْمُ مَنْ لَمْ يَفِ بِالْعَهْدِ

١٣٤٠ – عَنْ سَهْلِ بْنِ أَبِى حَثْمَةَ ﷺ قَالَ انْطَلَقَ عَبْدُ اللَّهِ بْنُ سَهْلٍ وَمُحَيِّصَةُ بْنُ مَسْعُودِ بْنِ زَيْدٍ رضي الله عنهما إِلَى خَيْبَرَ، وَهِىَ يَوْمَئِذٍ صُلْحٌ، فَتَفَرَّقَا، فَأَتَى مُحَيِّصَةُ إِلَى عَبْدِ اللَّهِ بْنِ سَهْلٍ وَهُوَ يَتَشَحَّطُ فِى دَمٍ قَتِيلاً، فَدَفَنَهُ ثُمَّ قَدِمَ

الْمَدِينَةِ، فَانْطَلَقَ عَبْدُ الرَّحْمَنِ بْنُ سَهْلٍ وَمُحَيِّصَةُ وَحُوَيِّصَةُ ابْنَا مَسْعُودٍ إِلَى النَّبِيِّ ﷺ، فَذَهَبَ عَبْدُ الرَّحْمَنِ يَتَكَلَّمُ فَقَالَ: «كَبِّرْ كَبِّرْ». وَهُوَ أَحْدَثُ الْقَوْمِ، فَسَكَتَ فَتَكَلَّمَا فَقَالَ: «أَتَحْلِفُونَ وَتَسْتَحِقُّونَ قَاتِلَكُمْ أَوْ صَاحِبَكُمْ». قَالُوا وَكَيْفَ نَحْلِفُ وَلَمْ نَشْهَدْ وَلَمْ نَرَ قَالَ: «فَتُبْرِيكُمْ يَهُودُ بِخَمْسِينَ». فَقَالُوا كَيْفَ نَأْخُذُ أَيْمَانَ قَوْمٍ كُفَّارٍ فَعَقَلَهُ النَّبِيُّ ﷺ مِنْ عِنْدِهِ. [رواه البخاري: ٣١٧٣]

**1340.** Rəvayət edilir ki, Səhl ibn Əbu Həsmə ﷺ demişdir: "(Xeybərlilərlə müsəlmanlar arasında) sülh müqaviləsi olduğu bir vaxtda Abdullah ibn Səhl və Müheyyisə ibn Məsud Xeybərə yollandı. Orada onlar bir-birindən ayrıldılar. Bir qədər sonra Müheyyisə Abdullah ibn Səhlin yanına qayıtdıqda onun qanına qəltan edildiyini gördü. Muheyyisə onu dəfn etdi, sonra da Mədinəyə qayıtdı. Abdur-Rəhman ibn Səhl, Muheyyisə ibn Məsud və Huveyyisə ibn Məsud Peyğəmbərin ﷺ yanına gəldilər və yaşca hamıdan balaca olan Abdur-Rəhman danışmaq istədikdə Peyğəmbər ﷺ: "Böyüyünüz (danışsın), böyüyünüz!"- deyə buyurdu. Onda Abdur-Rəhman susdu və digər iki əshabə danışmağa başladı. (Peyğəmbər ﷺ onları dinlədikdən) sonra dedi: "Qardaşınızın qanını yerdə qoymayasınız deyə (onun kim tərəfindən ölüdürüldüyünə) and içə bilərsinizmi?" Onlar dedilər: "(Hadisənin) şahidi olmadığımız və (onu) görmədiyimiz halda biz necə and içə bilərik?!" Peyğəmbər ﷺ dedi: "Qoy yəhudilərdən əlli nəfər (bu cinayəti etmədiklərinə dair) and içməklə sizin yanınızda özlərinə bəraət qazandırsınlar." Onlar dedilər: "Kafir adamların andına biz necə inana bilərik?" Belə olduqda Peyğəmbər ﷺ öz malından onlara qanbahasını verdi. (əl-Buxari, 3173)

## ٦– باب: هَلْ يُعْفَى عَنِ الذِّمِّيِّ إِذَا سَحَرَ

## 6-cı fəsil. Sehrlə məşğul olan zimmini[1] bağışlamaq olarmı?

١٣٤١ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ سُحِرَ حَتَّى كَانَ يُخَيَّلُ إِلَيْهِ أَنَّهُ صَنَعَ شَيْئًا وَلَمْ يَصْنَعْهُ. [رواه البخاري: ٣١٧٥]

**1341.** Aişə رضي الله عنها rəvayət edir ki, (bir zaman) Peyğəmbərə ﷺ sehr edilmişdi. (Elə bu səbəbdən də) həqiqətdə etmədiyi bir iş onun xəyalına girirdi." (əl-Buxari, 3175)

## ٧– باب: مَا يُحْذَرُ مِنَ الْغَدْرِ

## 7-ci fəsil. Xəyanətə məruz qalmaqdan ehtiyat etmək

١٣٤٢ – عَنْ عَوْفِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: أَتَيْتُ النَّبِيَّ ﷺ فِي غَزْوَةِ تَبُوكَ، وَهُوَ فِي قُبَّةٍ مِنْ أَدَمٍ فَقَالَ: «اعْدُدْ سِتًّا بَيْنَ يَدَيِ السَّاعَةِ، مَوْتِي، ثُمَّ فَتْحُ بَيْتِ الْمَقْدِسِ، ثُمَّ مُوتَانٌ يَأْخُذُ فِيكُمْ كَقُعَاصِ الْغَنَمِ، ثُمَّ اسْتِفَاضَةُ الْمَالِ حَتَّى يُعْطَى الرَّجُلُ مِائَةَ دِينَارٍ فَيَظَلُّ سَاخِطًا، ثُمَّ فِتْنَةٌ لاَ يَبْقَى بَيْتٌ مِنَ الْعَرَبِ إِلاَّ دَخَلَتْهُ، ثُمَّ هُدْنَةٌ تَكُونُ بَيْنَكُمْ وَبَيْنَ بَنِي الأَصْفَرِ فَيَغْدِرُونَ، فَيَأْتُونَكُمْ تَحْتَ ثَمَانِينَ غَايَةً، تَحْتَ كُلِّ غَايَةٍ اثْنَا عَشَرَ أَلْفًا». [رواه البخاري: ٣١٧٦]

**1342.** Rəvayət edilir ki, Auf ibn Malik ﷺ demişdir: "Təbuk döyüşündə Peyğəmbər ﷺ dəridən düzəldilmiş çadırda ikən mən onun yanına gəldim və o (mənə) dedi: "Qiyamət saatı gəlməzdən əvvəl baş verəcək bu altı əlaməti say: mənim

---

[1] 1079-cu hədisin fəslinin qeydlərinə bax.

ölümüm, sonra Beytul-Məqdisin[1] fəth edilməsi, sonra qoyunları qırıb-çatan tumov[2] xəstəliyi kimi sizi məhv edəcək azar, sonra mal-dövlət o qədər artacaq ki, birisinə yüz dinar verildikdə bundan narazı qalacaq, sonra elə bir fitnə (meydana gələcək) ki, ərəblərdən hər birinin evinə girəcək, daha sonra rumlularla sizin aranızda sülh bağlanılacaq və (çox keçmədən) onlar bu əhdi pozub hər birinin altında on iki minlik qoşun olan səksən bayraqla[3] sizin üstünüzə gələcəklər." (əl-Buxari, 3176)

## 8-ci fəsil. Əhd bağladıqdan sonra xəyanət edən kimsənin günahı

## ٨– باب: إِثْمُ مَنْ عَاهَدَ ثُمَّ غَدَرَ

١٣٤٣ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ قَالَ كَيْفَ أَنْتُمْ إِذَا لَمْ تَجْتَبُوا دِينَارًا وَلاَ دِرْهَمًا فَقِيلَ لَهُ وَكَيْفَ تَرَى ذَلِكَ كَائِنًا يَا أَبَا هُرَيْرَةَ قَالَ إِىْ وَالَّذِى نَفْسُ أَبِى هُرَيْرَةَ بِيَدِهِ عَنْ قَوْلِ الصَّادِقِ الْمَصْدُوقِ. قَالُوا عَمَّ ذَاكَ قَالَ تُنْتَهَكُ ذِمَّةُ اللَّهِ وَذِمَّةُ رَسُولِهِ ﷺ، فَيَشُدُّ اللَّهُ عَزَّ وَجَلَّ قُلُوبَ أَهْلِ الذِّمَّةِ، فَيَمْنَعُونَ مَا فِى أَيْدِيهِمْ. [رواه البخاري: ٣١٨٠]

**1343.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "(Kafirlərdən cizyə olaraq) dinar və dirhəm ala bilməyəcəyiniz təqdirdə sizin axırınız necə olacaq?" (Ətrafındakılar) dedilər: "Sən niyə düşünürsən ki, belə bir şey baş verə bilər, ey Əbu Hureyra?" O dedi: "Bəli, Əbu Hureyranın canı Əlində olan Allaha and olsun ki, mən doğru danışan və doğruluğu təsdiq edilmiş Peyğəmbərin ﷺ sözünü bilirəm." Onlar: "Nədir o söz?"- deyə soruşdular. Əbu Hureyra dedi: "Allahın və Onun elçisinin ﷺ (qeyri-müsəlmanlara) verdiyi zəmanətə riayət edilməyəcək. Onda qüdrətli və əzəmətli Allah müsəlman ölkəsində yaşayan kafirlərin qəlbinə elə bir arxayınlıq salacaq ki, onlar mallarını sizə verməkdən imtina edəcəklər." (əl-Buxari, 3180)

## 9-cu fəsil. Yaxşı adama və ya günahkara xəyanət edən kimsənin günahı

## ٩– باب: إِثْمُ الْغَادِرِ لِلْبَرِّ وَالْفَاجِرِ

١٣٤٤ – عَنْ عَبْدِ اللَّهِ وَ أَنَسٍ ﵄ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لِكُلِّ غَادِرٍ لِوَاءٌ يَوْمَ الْقِيَامَةِ – قَالَ أَحَدُهُمَا يُنْصَبُ وَقَالَ الآخَرُ – يُرَى يَوْمَ الْقِيَامَةِ يُعْرَفُ بِهِ». [رواه البخاري: ٣١٨٦–٣١٨٧]

**1344.** Abdullah (ibn Məsud) və Ənəs ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əhdi pozan hər xainin Qiyamət günü yanında bir bayraq olacaq."

Ravilərdən biri: "(Bayraq) dikəldiləcək"– demiş, digəri isə: "Qiyamət günü (hamı) onu görəcək və onun sayəsində o (xain) tanınacaq"- demişdir. (əl-Buxari, 3186-3187)

---

[1] 38-ci hədisin qeydlərinə bax.

[2] Burunun daxili qişasının iltihabı nəticəsində burundan selik axma və tez-tez asqırma şəklində təzahür edən xəstəlik.

[3] Yəni doqquz yüz altmış minlik qoşunla.

# ٥٩ – كِتَابُ بَدْءِ الخَلْقِ

# 59 – Yaradılışın başlanğıcı kitabı

## ١ – باب: مَا جَاءَ فِي قَوْلِ اللَّهِ تَعَالَى: ﴿وَهُوَ ٱلَّذِى يَبْدَؤُا۟ ٱلْخَلْقَ ثُمَّ يُعِيدُهُۥ﴾

## 1-ci fəsil. Uca Allahın: "Məxluqatı ilk dəfə *yoxdan* yaradan, sonra onu bir daha təkrarlayan Odur"[1] sözü barəsində deyilənlər

١٣٤٥ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ﷺ قَالَ جَاءَ نَفَرٌ مِنْ بَنِى تَمِيمٍ إِلَى النَّبِىِّ ﷺ فَقَالَ: «يَا بَنِى تَمِيمٍ، أَبْشِرُوا». قَالُوا بَشَّرْتَنَا فَأَعْطِنَا. فَتَغَيَّرَ وَجْهُهُ، فَجَاءَهُ أَهْلُ الْيَمَنِ، فَقَالَ: «يَا أَهْلَ الْيَمَنِ، اقْبَلُوا الْبُشْرَى إِذْ لَمْ يَقْبَلْهَا بَنُو تَمِيمٍ». قَالُوا قَبِلْنَا. فَأَخَذَ النَّبِىُّ ﷺ يُحَدِّثُ بَدْءَ الْخَلْقِ وَالْعَرْشِ، فَجَاءَ رَجُلٌ فَقَالَ يَا عِمْرَانُ، رَاحِلَتُكَ تَفَلَّتَتْ، لَيْتَنِى لَمْ أَقُمْ. [رواه البخاري: ٣١٩٠]

**1345.** Rəvayət edilir ki, İmran ibn Hüseyn ﷺ demişdir: "Təmim oğullarından bir neçə nəfər Peyğəmbərin ﷺ yanına gəldi və Peyğəmbər ﷺ (onlara) dedi: "Sevinin, ey Təmim oğulları!" Onlar dedilər: "Bizə müjdə verdin. Elə isə bizə (nə verəcəksənsə, indi) ver!" (Bunu eşidəndə) Peyğəmbərin ﷺ siması dəyişdi. Bu əsnada onun yanına yəmənlilər gəldi və o, yəmənlilərə dedi: "Ey Yəmən əhli, bu müjdəni siz qəbul edin! Təmim oğulları onu qəbul etmək istəmədilər." (Yəmənlilər): "Qəbul etdik!"– dedilər. Bundan sonra Peyğəmbər ﷺ yaradılışın başlanğıcı və Ərş haqqında danışdı. Bu vaxt bir nəfər gəlib: "Ey İmran, sənin dəvən qaçmışdır!"– dedi. (Mən də dəvəmin dalınca getdim.) Amma gərək heç qalxıb getməzdim." (əl-Buxari, 3190)

١٣٤٦ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ﷺ قَالَ: دَخَلْتُ عَلَى النَّبِىِّ ﷺ وَعَقَلْتُ نَاقَتِى بِالْبَابِ، فَأَتَاهُ نَاسٌ مِنْ بَنِى تَمِيمٍ فَقَالَ: «اقْبَلُوا الْبُشْرَى يَا بَنِى تَمِيمٍ». قَالُوا قَدْ بَشَّرْتَنَا فَأَعْطِنَا. مَرَّتَيْنِ، ثُمَّ دَخَلَ عَلَيْهِ نَاسٌ مِنْ أَهْلِ الْيَمَنِ فَقَالَ: «اقْبَلُوا الْبُشْرَى يَا أَهْلَ الْيَمَنِ، إِذْ لَمْ يَقْبَلْهَا بَنُو تَمِيمٍ». قَالُوا قَدْ قَبِلْنَا يَا رَسُولَ اللَّهِ، قَالُوا جِئْنَاكَ نَسْأَلُكَ عَنْ هَذَا الأَمْرِ قَالَ: «كَانَ اللَّهُ وَلَمْ يَكُنْ شَىْءٌ غَيْرُهُ، وَكَانَ عَرْشُهُ عَلَى الْمَاءِ، وَكَتَبَ فِى الذِّكْرِ كُلَّ شَىْءٍ، وَخَلَقَ السَّمَوَاتِ وَالأَرْضَ». فَنَادَى مُنَادٍ ذَهَبَتْ نَاقَتُكَ يَا ابْنَ الْحُصَيْنِ. فَانْطَلَقْتُ فَإِذَا هِىَ يَقْطَعُ دُونَهَا السَّرَابُ، فَوَاللَّهِ لَوَدِدْتُ أَنِّى كُنْتُ تَرَكْتُهَا. [رواه البخاري: ٣١٩١]

**1346.** Rəvayət edilir ki, İmran ibn Hüseyn ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərin ﷺ (evinə) daxil oldum, dəvəmi də qapının yanına bağladım. Bu vaxt onun yanına Təmim oğullarından bir neçə adam gəldi və Peyğəmbər ﷺ (onlara) dedi: "Müjdəyə sevinin, ey Təmim oğulları!" Onlar iki dəfə təkrar-təkrar dedilər: "Bizə müjdə verdin. Elə isə bizə (nə verəcəksənsə,) ver!" Sonra onun yanına yəmənlilər gəldi və o, yəmənlilərə dedi: "Bu müjdəni siz qəbul edin, ey Yəmən əhli! Təmim oğulları onu qəbul etmək istəmədilər." (Yəmən-

[1] "ər-Rum" surəsi, 27

lilər): "Qəbul etdik, ya Rəsulullah!"- deyə cavab verdilər, sonra da əlavə edib dedilər: "Biz (yaradılışın başlanğıcı) haqqında soruşmaq üçün gəlmişik." Peyğəmbər ﷺ dedi: "Allah var idi və Ondan başqa heç bir şey yox idi. Onun Ərşi suyun üzərində idi. Allah Kitabda (olacaq) hər şeyi yazdı[1]. (Sonra) göyləri və yeri yaratdı. Bu vaxt bir nəfər (məni) səsləyib dedi: "Dəvən qaçdı, ey ibn Hüseyn!" Mən (onun dalınca) getdim və ilğıma bənzər bir şey gördüm. Kaş onun dalınca heç getməyəydim." (əl-Buxari, 3191)

١٣٤٧ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «يَقُولُ اللَّهُ شَتَمَنِى ابْنُ آدَمَ وَمَا يَنْبَغِى لَهُ أَنْ يَشْتِمَنِى، وَتَكَذَّبَنِى وَمَا يَنْبَغِى لَهُ، أَمَّا شَتْمُهُ فَقَوْلُهُ إِنَّ لِى وَلَدًا. وَأَمَّا يُكَذِّبُنِي فَقَوْلُهُ لَيْسَ يُعِيدُنِى كَمَا بَدَأَنِى». [رواه البخاري: ٣١٩٣]

**1347.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah buyurur: "Adəm övladı Məni təhqir edir[2], halbuki ona Məni təhqir etmək yaraşmaz. Habelə Məni yalançı hesab edir, halbuki ona (belə etmək) yaraşmaz. Onun təhqirinə gəlincə, (bu) onun Mənim oğlum olduğunu iddia etməsidir. Məni yalançı hesab etməsinə gəldikdə isə, (bu) onun: "(Allah) məni ilk dəfə yaratdığı kimi, yenidən yarada bilməz"– deməsidir." (əl-Buxari, 3193)

١٣٤٨ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لَمَّا قَضَى اللَّهُ الْخَلْقَ كَتَبَ فِى كِتَابِهِ، فَهْوَ عِنْدَهُ فَوْقَ الْعَرْشِ إِنَّ رَحْمَتِى غَلَبَتْ غَضَبِى». [رواه البخاري: ٣١٩٤]

**1348.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah məxluqatı yaratdıqdan sonra Ərşin üzərində, Öz yanında yerləşən Kitabında[3] bu (sözləri) yazmışdır: "Mənim rəhmətim qəzəbimi üstələmişdir." (əl-Buxari, 3194)

## 2-ci fəsil. Yeddi yer barəsində deyilənlər

## ٢– باب: مَا جَاءَ فِى سَبْعِ أَرَضِينَ

١٣٤٩ – عَنْ أَبِى بَكْرَةَ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «الزَّمَانُ قَد اسْتَدَارَ كَهَيْئَتِهِ يَوْمَ خَلَقَ السَّمَوَاتِ وَالأَرْضَ، السَّنَةُ اثْنَا عَشَرَ شَهْرًا، مِنْهَا أَرْبَعَةٌ حُرُمٌ، ثَلاَثَةٌ مُتَوَالِيَاتٌ ذُو الْقَعْدَةِ وَذُو الْحِجَّةِ وَالْمُحَرَّمُ، وَرَجَبُ مُضَرَ الَّذِى بَيْنَ جُمَادَى وَشَعْبَانَ». [رواه البخاري: ٣١٩٧]

**1349.** Əbu Bəkrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Zaman, Allah yerləri və göyü yaratdığı gündən bəri heç dəyişmədən dövran etməkdədir. İl on iki aydan ibarətdir. Bunlardan dördü haram aylardır. (Haram aylardan) üçü – zülqədə, zülhiccə və muhərrəm dalbadal gəlir. (Dördüncüsü isə) Mudər qəbiləsinin (digər on bir aydan üstün tutduğu) və cümadəl-Axir ilə Şaban (ayları) arasında keçən rəcəb ayıdır." (əl-Buxari, 3197)

---

[1] Hər şeyin qədərini əzəldən müəyyən edib Lövhi-Məhfuza yazmışdır.

[2] Müşriklər və kafirlər Allaha Ona layiq olmayan naqis sifətlər isnad etməklə Ona qarşı ədəbsizlik edirlər.

[3] Burada "Kitab" deyildikdə Lövhi-Məhfuz nəzərdə tutulur.

## 3-cü fəsil. Günəş və ayın müəyyən bir ölçü ilə hərəkət etməsi

## ٣- باب: صِفَةُ الشَّمْسِ وَالْقَمَرِ بِحُسْبَانٍ

١٣٥٠ – عَنْ أَبِي ذَرٍّ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ لأَبِي ذَرٍّ حِينَ غَرَبَتِ الشَّمْسُ: «تَدْرِي أَيْنَ تَذْهَبُ». قُلْتُ اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. قَالَ: «فَإِنَّهَا تَذْهَبُ حَتَّى تَسْجُدَ تَحْتَ الْعَرْشِ، فَتَسْتَأْذِنَ فَيُؤْذَنَ لَهَا، وَيُوشِكُ أَنْ تَسْجُدَ فَلاَ يُقْبَلَ مِنْهَا، وَتَسْتَأْذِنَ فَلاَ يُؤْذَنَ لَهَا، يُقَالُ لَهَا ارْجِعِي مِنْ حَيْثُ جِئْتِ. فَتَطْلُعُ مِنْ مَغْرِبِهَا، فَذَلِكَ قَوْلُهُ تَعَالَى: ﴿وَالشَّمْسُ تَجْرِي لِمُسْتَقَرٍّ لَّهَا ذَٰلِكَ تَقْدِيرُ الْعَزِيزِ الْعَلِيمِ﴾. [رواه البخاري: ٣١٩٩]

**1350.** Əbu Zərr ﷺ rəvayət etmişdir ki, (bir dəfə) günəş batarkən Peyğəmbər ﷺ məndən soruşdu: “Günəşin hara getdiyini bilirsənmi?” Dedim: “Allah və Onun elçisi daha yaxşı bilir!” Peyğəmbər ﷺ buyurdu: “O, gedib Ərşin altında səcdə edənədək (hərəkətinə) davam edir, sonra (yenidən) doğmaq üçün izn istəyir və ona izn verilir. Tezliklə elə bir zaman[1] gələcək ki, günəş (adəti üzrə) səcdə edəcək, lakin səcdəsi qəbul olunmayacaq, izn istəyəcək, amma ona iz verilməyəcək, üstəlik ona: “Gəldiyin yerə qayıt!” deyiləcək və o, (gedib) məğribdən doğacaq. Uca Allah bu xüsusda belə buyurur: “Günəş də özünün qaldığı yerə axıb gedir. Bu, Qüdrətli, Bilən *Allahın* əzəli hökmüdür.” (əl-Buxari, 3199)

١٣٥١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «الشَّمْسُ وَالْقَمَرُ مُكَوَّرَانِ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٣٢٠٠]

**1351.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Günəş və ay Qiyamət günü sarınıb büküləcəkdir.” (əl-Buxari, 3200)

## 4-cü fəsil. Allahın: “Küləkləri Öz mərhəməti önündə *yağışdan qabaq* müjdəçi olaraq göndərən Odur”[2] sözü haqqında deyilənlər

## ٤- باب: مَا جَاءَ فِي قَوْلِهِ: ﴿وَهُوَ الَّذِي يُرْسِلُ الرِّيَاحَ بُشْرًا بَيْنَ يَدَيْ رَحْمَتِهِ﴾

١٣٥٢ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: كَانَ النَّبِيُّ ﷺ إِذَا رَأَى مَخِيلَةً فِي السَّمَاءِ أَقْبَلَ وَأَدْبَرَ وَدَخَلَ وَخَرَجَ وَتَغَيَّرَ وَجْهُهُ، فَإِذَا أَمْطَرَتِ السَّمَاءُ سُرِّيَ عَنْهُ، فَعَرَّفَتْهُ عَائِشَةُ ذَلِكَ، فَقَالَ النَّبِيُّ ﷺ: «مَا أَدْرِي لَعَلَّهُ كَمَا قَالَ قَوْمٌ: ﴿فَلَمَّا رَأَوْهُ عَارِضًا مُّسْتَقْبِلَ أَوْدِيَتِهِمْ﴾ الآيَةَ». [رواه البخاري: ٣٢٠٦]

**1352.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Peyğəmbər ﷺ göy üzündə yağmurla yüklənmiş buludları gördükdə (təşviş içində) irəli-geri gedib gələr, (evə) girib çıxar və siması dəyişərdi[3]. Buludlardan yağış yağmağa başladıqda isə sakitləşərdi.”

Aişə Peyğəmbərin ﷺ nə hala düşdüyünü ona bildirdikdə o buyurmuşdur: “Bilmirəm, ola bilsin ki, (Ad) qövmünün başına gəlmiş (müsibət bu üm-

---

[1] Söhbət Qiyamət günündən gedir.

[2] “əl-Əraf” surəsi, 57

[3] Peyğəmbər ﷺ əvvəlki ümmətlərin başına yağdığı kimi, onun da ümmətinin başına bəla yağacağından ehtiyat edirdi. Əvvəlki ümmətlər barəsində bax: “əl-İsra” surəsi 68, “ən-Nur” surəsi 43, “əl-Əraf” surəsi, 83-84, “əl-Ənkəbut” 39-40.

mətin də) başına gəlsin: "Nəhayət, o *əzabı* vadilərinə doğru gələn bir bulud şəklində gördükdə: "Bu bizə yağış yağdıracaq buluddur!"– dedilər. *Hud dedi:* "Xeyr! Bu sizin tez gəlməsini istədiyiniz – özü ilə ağrılı-acılı əzab gətirən bir küləkdir!"[1] (əl-Buxari, 3206)

## 5-ci fəsil. Mələklər haqqında deyilənlər

## ٥– باب: ذِكْرُ الْمَلاَئِكَةِ عليهم السلام

١٣٥٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: حَدَّثَنَا رَسُولُ اللَّهِ ﷺ وَهُوَ الصَّادِقُ الْمَصْدُوقُ قَالَ: «إِنَّ أَحَدَكُمْ يُجْمَعُ خَلْقُهُ فِى بَطْنِ أُمِّهِ أَرْبَعِينَ يَوْمًا، ثُمَّ يَكُونُ عَلَقَةً مِثْلَ ذَلِكَ، ثُمَّ يَكُونُ مُضْغَةً مِثْلَ ذَلِكَ، ثُمَّ يَبْعَثُ اللَّهُ مَلَكًا، فَيُؤْمَرُ بِأَرْبَعِ كَلِمَاتٍ، وَيُقَالُ لَهُ اكْتُبْ عَمَلَهُ وَرِزْقَهُ وَأَجَلَهُ وَشَقِىٌّ أَوْ سَعِيدٌ. ثُمَّ يُنْفَخُ فِيهِ الرُّوحُ، فَإِنَّ الرَّجُلَ مِنْكُمْ لَيَعْمَلُ حَتَّى مَا يَكُونُ بَيْنَهُ وَبَيْنَ الْجَنَّةِ إِلاَّ ذِرَاعٌ، فَيَسْبِقُ عَلَيْهِ كِتَابُهُ، فَيَعْمَلُ بِعَمَلِ أَهْلِ النَّارِ، وَيَعْمَلُ حَتَّى مَا يَكُونُ بَيْنَهُ وَبَيْنَ النَّارِ إِلاَّ ذِرَاعٌ، فَيَسْبِقُ عَلَيْهِ الْكِتَابُ، فَيَعْمَلُ بِعَمَلِ أَهْلِ الْجَنَّةِ». [رواه البخاري: ٣٢٠٨]

**1353.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Doğru danışan və doğruluğu təsdiq edilmiş Rəsulullah ﷺ bizə belə bir hədis danışmışdır: "Sizlərdən hər kəs anasının bətnində xəlq edilərkən ilk qırx gün ərzində nütfə halında, sonrakı qırx gündə qan laxtası, daha sonrakı qırx gündə isə ət parçası olur. Sonra Allah (onun yanına) bir mələk göndərir. Bu mələyə dörd şey (yazmaq) əmr edilir və ona: "(Bu uşağın) əməlini, ruzisini, əcəlini, bədbəxt və ya xoşbəxt olacağını yaz!"– deyilir. Sonra ona ruh üfürülür. Həqiqətən, içinizdən kimsə o qədər yaxşı işlər görə bilər ki, axırda onunla Cənnət arasında bir ərəş[2] məsafə qalar. Lakin əzəldən yazılmış qədəri onu qabaqlayar və o, Cəhənnəm əhlinin əməlinə bənzər əməllər edər. (Həmçinin) biriniz o qədər pis işlər görər ki, axırda onunla Cəhənnəm arasında bir ərəş məsafə qalar. Lakin əzəldən yazılmış qədəri onu qabaqlayar və o, Cənnət əhlinin əməlinə bənzər əməllər edər." (əl-Buxari, 3208)

١٣٥٤ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «إِذَا أَحَبَّ اللَّهُ الْعَبْدَ نَادَى جِبْرِيلَ إِنَّ اللَّهَ يُحِبُّ فُلاَنًا فَأَحْبِبْهُ. فَيُحِبُّهُ جِبْرِيلُ، فَيُنَادِى جِبْرِيلُ فِى أَهْلِ السَّمَاءِ إِنَّ اللَّهَ يُحِبُّ فُلاَنًا فَأَحِبُّوهُ. فَيُحِبُّهُ أَهْلُ السَّمَاءِ، ثُمَّ يُوضَعُ لَهُ الْقَبُولُ فِى الأَرْضِ». [رواه البخاري: ٣٢٠٩]

**1354.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah bir qulunu sevdiyi zaman Cəbrailə: "Allah filankəsi sevir, sən də onu sev!"– deyə buyurur, Cəbrail də (həmin adamı) sevir. Sonra Cəbrail göy əhlinə xitab edib: "Allah filankəsi sevir, siz də onu sevin!"– deyir, göy əhli də onu sevir. Daha sonra yer üzündəkilər də ona rəğbət bəsləməyə başlayırlar." (əl-Buxari, 3209)

١٣٥٥ – عَنْ عَائِشَةَ ﷺ زَوْجِ النَّبِىِّ ﷺ أَنَّهَا سَمِعَتْ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِنَّ الْمَلاَئِكَةَ تَنْزِلُ فِى الْعَنَانِ – وَهُوَ السَّحَابُ – فَتَذْكُرُ الأَمْرَ قُضِىَ فِى السَّمَاءِ، فَتَسْتَرِقُ الشَّيَاطِينُ السَّمْعَ، فَتَسْمَعُهُ فَتُوحِيهِ إِلَى الْكُهَّانِ، فَيَكْذِبُونَ مَعَهَا مِائَةَ كَذْبَةٍ مِنْ عِنْدِ أَنْفُسِهِمْ». [رواه البخاري: ٣٢١٠]

---

[1] "əl-Əhqaf" surəsi, 24.
[2] 311-ci hədisin qeydlərinə bax.

**1355.** Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: “Həqiqətən, mələklər buludların içində (yerə doğru) enir və göydə verilmiş qərar bərəsində söhbət açırlar. (Bu vaxt) şeytanlar (mələklərə) oğrun-oğrun qulaq asırlar, sonra da eşitdikləri adda-budda sözləri, üstəlik özlərindən uydurduqları yüz yalanı da bu doğru xəbərlə yanaşı kahinlərə təlqin edirlər.” (əl-Buxari, 3210)

١٣٥٦ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «إِذَا كَانَ يَوْمُ الْجُمُعَةِ كَانَ عَلَى كُلِّ بَابٍ مِنْ أَبْوَابِ الْمَسْجِدِ الْمَلاَئِكَةُ، يَكْتُبُونَ الأَوَّلَ فَالأَوَّلَ، فَإِذَا جَلَسَ الإِمَامُ طَوَوُا الصُّحُفَ وَجَاءُوا يَسْتَمِعُونَ الذِّكْرَ». [رواه البخاري: ٣٢١١]

**1356.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cümə günü yetişdiyi zaman mələklər məscidin qapılarının önündə düzülüb (ora gələn adamları) birbəbir siyahıya alırlar. İmam minbərə oturduqda isə mələklər səhifələri büküb xütbəni dinləməyə gəlirlər.” (əl-Buxari, 3211)

١٣٥٧ – عَنْ الْبَرَاءِ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ لِحَسَّانَ: «اهْجُهُمْ – أَوْ هَاجِهِمْ – وَجِبْرِيلُ مَعَكَ». [رواه البخاري: ٣٢١٣]

**1357.** Bəra ibn Azib رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ (kafirlərin cavabını vermək üçün) Həssana deyərdi: “Onlara şeirlə cavab ver! (Arxayın ol,) Cəbrail də səninlədir.” (əl-Buxari, 3213)

١٣٥٨ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ قَالَ لَهَا: «يَا عَائِشَةُ، هَذَا جِبْرِيلُ يَقْرَأُ عَلَيْكِ السَّلاَمَ». فَقَالَتْ وَعَلَيْهِ السَّلاَمُ وَرَحْمَةُ اللَّهِ وَبَرَكَاتُهُ. تَرَى مَا لاَ أَرَى. تُرِيدُ النَّبِيَّ ﷺ. [رواه البخاري: ٣٢١٧]

**1358.** Aişəyə رضي الله عنها rəvayət edir ki, (bir zaman) Peyğəmbər ﷺ ona demişdir: “Ey Aişə! Budur, Cəbrail sənə salam söyləyir!” Aişə də (cavabında) demişdir: “Ona salam olsun, Allahın rəhməti və Onun bərəkəti yetişsin! Sən mənim görmədiyimi görürsən.”

(Bunu deyəndə) o, Peyğəmbəri ﷺ qəsd edirdi. (əl-Buxari, 3217)

١٣٥٩ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لِجِبْرِيلَ: «أَلاَ تَزُورُنَا أَكْثَرَ مِمَّا تَزُورُنَا» قَالَ فَنَزَلَتْ: ﴿وَمَا نَتَنَزَّلُ إِلَّا بِأَمْرِ رَبِّكَ لَهُۥ مَا بَيْنَ أَيْدِينَا وَمَا خَلْفَنَا﴾ الآيَةَ. [رواه البخاري: ٣٢١٨]

**1359.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ Cəbrailə dedi: “Niyə bizi daha çox ziyarət etmirsən?” Uca Allah da bu ayəni nazil etdi: “(Mələklər dedi): “Biz dünyaya ancaq sənin Rəbbinin əmri ilə enirik. Önümüzdə, arxamızda və onların arasında nə varsa, Ona məxsusdur”[1]. (əl-Buxari, 3218)

١٣٦٠ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «أَقْرَأَنِي جِبْرِيلُ عَلَى حَرْفٍ، فَلَمْ أَزَلْ أَسْتَزِيدُهُ حَتَّى انْتَهَى إِلَى سَبْعَةِ أَحْرُفٍ». [رواه البخاري: ٣٢١٩]

**1360.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cəbrail mənə (Allahın Kitabını) bir qiraətlə[2] oxumağı öyrətdi, lakin mən ondan daha çox (şey)

---

[1] “Məryəm” surəsi, 64.
[2] Müəyyən üsul və qayda ilə Quran oxumaq.

öyrənmək istədim. Nəhayət, o mənə (Quranı) yeddi qiraətlə oxumağı öyrətdi." (əl-Buxari, 3219)

١٣٦١ – عَنْ يَعْلَى ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقْرَأُ عَلَى الْمِنْبَرِ: ﴿وَنَادَوْا يَا مَالِ﴾. [رواه البخاري: ٣٢٣٠]

**1361.** Rəvayət edilir ki, Yə'lə ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ minbərdə ikən belə dediyini eşitmişəm: "Onlar deyəcəklər: "Ey Mali![1]"[2] (əl-Buxari, 3230)

١٣٦٢ – عَنْ عَائِشَةَ ﷺ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّهَا قَالَتْ لِلنَّبِيِّ ﷺ هَلْ أَتَى عَلَيْكَ يَوْمٌ كَانَ أَشَدَّ مِنْ يَوْمِ أُحُد قَالَ: «لَقَدْ لَقِيتُ مِنْ قَوْمِك مَا لَقِيتُ، وَكَانَ أَشَدُّ مَا لَقِيتُ مِنْهُمْ يَوْمَ الْعَقَبَة، إِذْ عَرَضْتُ نَفْسِى عَلَى ابْنِ عَبْد يَالِيلَ بْنِ عَبْد كُلاَلَ، فَلَمْ يُجِبْنِى إِلَى مَا أَرَدْتُ، فَانْطَلَقْتُ وَأَنَا مَهْمُومٌ عَلَى وَجْهِى، فَلَمْ أَسْتَفِقْ إِلاَّ وَأَنَا بِقَرْنِ الثَّعَالِب، فَرَفَعْتُ رَأْسِى، فَإِذَا أَنَا بِسَحَابَة قَدْ أَظَلَّتْنِى، فَنَظَرْتُ فَإِذَا فِيهَا جِبْرِيلُ فَنَادَانِى فَقَالَ إِنَّ اللَّهَ قَدْ سَمِعَ قَوْلَ قَوْمِكَ لَكَ وَمَا رَدُّوا عَلَيْكَ، وَقَدْ بَعَثَ إِلَيْكَ مَلَكَ الْجِبَالِ لِتَأْمُرَهُ بِمَا شِئْتَ فِيهِمْ، فَنَادَانِى مَلَكُ الْجِبَالِ، فَسَلَّمَ عَلَيَّ ثُمَّ قَالَ يَا مُحَمَّدُ، فَقَالَ ذَلِكَ فِيمَا شِئْت، إِنْ شِئْتَ أَنْ أُطْبِقَ عَلَيْهِمِ الأَخْشَبَيْنِ، فَقَالَ النَّبِيُّ ﷺ بَلْ أَرْجُو أَنْ يُخْرِجَ اللَّهُ مِنْ أَصْلاَبِهِمْ مَنْ يَعْبُدُ اللَّهَ وَحْدَهُ لاَ يُشْرِكُ بِهِ شَيْئًا». [رواه البخاري: ٣٢٣١]

**1362.** Rəvayət edilir ki, (bir dəfə) Peyğəmbərin ﷺ zövcəsi Aişə ﷺ Peyğəmbərdən ﷺ soruşdu: "Sənin Uhud günündən[3] daha ağır bir günün olubmu?" Peyğəmbər ﷺ dedi: "Mən artıq sənin həmqəbilələrindən[4] çəkdiyimi çəkmişəm. Ən çox əziyyət çəkdiyim (gün) isə Əqəbə günü[5] olmuşdur. O vaxt ki, mən ibn Abdu-Yaleyl ibn Abdu-Kulalədən[6] mənə himayə olmağı xahiş etdim, lakin o mənə dəstək vermədi. Mən iztirab çəkə-çəkə geri döndüm və ancaq Qərnis-Səalibə[7] gəlib çatdıqda özümə gəldim. Həmin vaxt mən başımı yuxarı qaldırıb üstümə kölgə salan bir bulud gördüm. Mən buluda diqqət yetirdikdə içində Cəbraili gördüm. O məni səsləyib dedi: "Allah sənin həmqəbilələrinin nə dediklərini və sənə necə rədd cavabı verdiklərini eşitdi. Rəbbin dağlar mələyini sənin yanına göndərib ki, onları (bəlaya düçar etmək) xüsusunda istədiyini bu mələyə əmr edəsən". Dağlar mələyi mənə salam verdikdən sonra dedi: "Ey Muhəmməd, nə istəyirsənsə, (buyur)! İstəyirsənsə, bu iki dağı[8] onların başına uçurdum!" Peyğəmbər ﷺ dedi: "Xeyr, mən ancaq onu diləyirəm ki, Allah onların belindən Tək Allaha ibadət edən və Ona heç bir şeyi şərik qoşmayan kimsələr gətirsin!" (əl-Buxari, 3231)

١٣٦٣ – عَنْ عَبْد اللهِ بْنِ مَسْعُود ﷺ فِي قَوْلِ اللَّهِ تَعَالَى: ﴿فَكَانَ قَابَ قَوْسَيْنِ أَوْ أَدْنَىٰ ﴿٩﴾ فَأَوْحَىٰٓ إِلَىٰ عَبْدِهِۦ مَآ أَوْحَىٰ ﴿١٠﴾﴾ أَنَّهُ رَأَى جِبْرِيلَ لَهُ سِتُّمِائَةِ جَنَاحٍ. [رواه البخاري: ٣٢٣٢]

---

[1] Qiraətlərə görə "Mali" və ya "Malik" Quranda zikr edilmiş mələyin, Cəhənnəm gözətçisinin adıdır.
[2] "əz-Zuxruf" surəsi, 77.
[3] Uhud döyüşündə müsəlmanlar məğlubiyyətə uğramışlar və bu döyüşdə əshabələrdən yetmiş nəfər şəhid olmuşdur.
[4] Yəni ərəblərdən.
[5] Çox güman ki, burada Peyğəmbərin ﷺ Taifdə olduğu zaman taiflilər tərəfindən çox şiddətli təzyiqlərə məruz qalması nəzərdə tutulur.
[6] İbn Abdu-Yaleyl ibn Abdu-Kulalə Taifin yaxınlığında yerləşən Səqif qəbiləsinin başçılarından biri olmuşdur.
[7] Bu, Məkkə ilə Taif arasında yerləşən dağın adıdır. Bura həmçinin Qərnul-Mənazil də deyilir.
[8] Hədisdə "iki dağ" deyildikdə Məkkədə yerləşən Əbu Qubeys və Queyqian dağları nəzərdə tutulur.

**1363.** Abdullah ibn Məsud ﵁ Uca Allahın: "O, iki yay uzunluğunda, hətta ondan da yaxın məsafədə idi. Sonra *Allah* Öz quluna nazil edəcəyini vəhy etdi"[1] ayəsini təfsir edib demişdir: "Peyğəmbər ﷺ Cəbraili gördü. Onun altı yüz qanadı var idi." (əl-Buxari, 3232)

**١٣٦٤** – عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ﵁ فِي قَوْلِ اللَّهِ تَعَالَى: ﴿لَقَدْ رَأَىٰ مِنْ ءَايَٰتِ رَبِّهِ ٱلْكُبْرَىٰٓ ﴿١٨﴾﴾ قَالَ: رَأَى رَفْرَفًا أَخْضَرَ سَدَّ أُفُقَ السَّمَاءِ. [رواه البخاري: ٣٢٣٣]

**1364.** Abdullah ibn Məsud ﵁ Uca Allahın: "O, öz Rəbbinin ən böyük dəlillərindən *bəzisini* gördü"[2] ayəsini izah edib demişdir: "*Orada* Peyğəmbər ﷺ bütün üfüqü tutmuş yaşıl xalça gördü." (əl-Buxari, 3233)

**١٣٦٥** – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: مَنْ زَعَمَ أَنَّ مُحَمَّدًا رَأَى رَبَّهُ فَقَدْ أَعْظَمَ، وَلَكِنْ قَدْ رَأَى جِبْرِيلَ فِي صُورَتِهِ، وَخَلْقُهُ سَادٌّ مَا بَيْنَ الأُفُقِ. [رواه البخاري: ٣٢٣٤]

**1365.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Kim iddia etsə ki, Muhəmməd Rəbbini görmüşdür, o, böyük günah işlətmiş olar. Lakin o, Cəbraili öz surətində və xilqətində, bütün üfüqü tutmuş vəziyyətdə görmüşdür. " (əl-Buxari, 3234)

**١٣٦٦** – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِذَا دَعَا الرَّجُلُ امْرَأَتَهُ إِلَى فِرَاشِهِ فَأَبَتْ، فَبَاتَ غَضْبَانَ عَلَيْهَا، لَعَنَتْهَا الْمَلَائِكَةُ حَتَّى تُصْبِحَ». [رواه البخاري: ٣٢٣٧]

**1366.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kişi öz həyat yoldaşını yatağına çağırdığı zaman qadın (ona) yaxınlıq verməsə və əri (bu səbəbdən) ona qəzəbi tutmuş halda yatsa, mələklər səhərə qədər o qadına lənət oxuyar." (əl-Buxari, 3237)

**١٣٦٧** – عَنِ ابْنِ عَبَّاسٍ ﵄ عَنِ النَّبِيِّ ﷺ قَالَ:«رَأَيْتُ لَيْلَةَ أُسْرِيَ بِي مُوسَى رَجُلاً آدَمَ طُوَالاً جَعْدًا، كَأَنَّهُ مِنْ رِجَالِ شَنُوءَةَ، وَرَأَيْتُ عِيسَى رَجُلاً مَرْبُوعًا مَرْبُوعَ الْخَلْقِ إِلَى الْحُمْرَةِ وَالْبَيَاضِ، سَبْطَ الرَّأْسِ، وَرَأَيْتُ مَالِكًا خَازِنَ النَّارِ وَالدَّجَّالَ فِي آيَاتٍ أَرَاهُنَّ اللَّهُ إِيَّاهُ ﴿فَلَا تَكُن فِى مِرْيَةٍ مِّن لِّقَآئِهِۦ﴾. [رواه البخاري: ٣٢٣٩]

**1367.** İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən isra gecəsində[3] Musanı gördüm. Qarabuğdayı, hündürboylu və qıvrımsaçlı bir adam idi, lap Şənuə qəbiləsinin kişiləri kimi. (Məryəm oğlu) İsanı da gördüm. Ortaboylu, alyanaq, ağbəniz və nazik saçlı bir adam idi. Həmçinin Cəhənnəmin gözətçisi Maliki və Allahın mənə göstərdiyi əlamətlərə uyğun şəkildə dəccalı gördüm."

"(Biz Musaya Kitab vermişdik.) Sən onunla görüşəcəyinə şübhə etmə."[4] (əl-Buxari, 3239)

---

[1] "ən-Nəcm" surəsi, 9-10.

[2] "ən-Nəcm" surəsi, 18.

[3] Hədisdə Peyğəmbərimizin ﷺ gecə ikən Məscidulharamdan Məsciduləqsaya getməsi nəzərdə tutulur. Əlavə məlumat üçün "əl-İsra" surəsinin 1-ci ayəsinə və onun təfsirinə bax.

[4] "əs-Səcdə" surəsi, 23.

## 6-cı fəsil. Cənnətin xüsusiyyətləri barədə deyilənlər və Cənnətin məxluq olması

## ٦– باب: مَا جَاءَ فِى صِفَةِ الْجَنَّةِ وَأَنَّهَا مَخْلُوقَةٌ

١٣٦٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِذَا مَاتَ أَحَدُكُمْ فَإِنَّهُ يُعْرَضُ عَلَيْهِ مَقْعَدُهُ بِالْغَدَاةِ وَالْعَشِيِّ، فَإِنْ كَانَ مِنْ أَهْلِ الْجَنَّةِ فَمِنْ أَهْلِ الْجَنَّةِ، وَإِنْ كَانَ مِنْ أَهْلِ النَّارِ فَمِنْ أَهْلِ النَّارِ». [رواه البخاري: ٣٢٤٠]

**1368.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz öldüyü zaman səhər-axşam ona düşəcəyi yer göstərilir. Cənnət əhlindən olarsa, Cənnətdəki yeri, Cəhənnəm əhlindən olarsa, Cəhənnəmdəki yeri (ona göstərilər)." (əl-Buxari, 3240)

١٣٦٩ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ: «اطَّلَعْتُ فِى الْجَنَّةِ فَرَأَيْتُ أَكْثَرَ أَهْلِهَا الْفُقَرَاءَ، وَاطَّلَعْتُ فِى النَّارِ فَرَأَيْتُ أَكْثَرَ أَهْلِهَا النِّسَاءَ». [رواه البخاري: ٣٢٤١]

**1369.** İmran ibn Hüseyn ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən Cənnətə baxdım və onun sakinlərinin əksəriyyətinin kasıblar olduğunu gördüm. Həmçinin Cəhənnəmə baxdım və onun sakinlərinin əksəriyyətinin qadınlar olduğunu gördüm." (əl-Buxari, 3241)

١٣٧٠ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ بَيْنَا نَحْنُ عِنْدَ رَسُولِ اللَّهِ ﷺ إِذْ قَالَ: «بَيْنَا أَنَا نَائِمٌ رَأَيْتُنِى فِى الْجَنَّةِ، فَإِذَا امْرَأَةٌ تَتَوَضَّأُ إِلَى جَانِبِ قَصْرٍ، فَقُلْتُ لِمَنْ هَذَا الْقَصْرُ فَقَالُوا لِعُمَرَ بْنِ الْخَطَّابِ، فَذَكَرْتُ غَيْرَتَهُ، فَوَلَّيْتُ مُدْبِرًا». فَبَكَى عُمَرُ وَقَالَ أَعَلَيْكَ أَغَارُ يَا رَسُولَ اللَّهِ. [رواه البخاري: ٣٢٤٢]

**1370.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) biz Peyğəmbərin ﷺ yanında ikən o dedi: "Yuxuda gördüm ki, Cənnətdəyəm. Baxdım ki, bir zənən xeylağı (möhtəşəm) bir qəsrin yanında durub dəstəmaz alır. Mən: "Bu kimin qəsridir?"– deyə soruşdum. "Ömər ibn Xəttabındır!"– dedilər. Elə bu vaxt Ömərin qısqanclığı yadıma düşdü və mən dönüb (oradan) uzaqlaşdım."

(Bunu eşidəndə) Ömər ağlamağa başladı və dedi: "Heç səni qısqana bilərəmmi, ya Rəsulullah?!" (əl-Buxari, 3242)

١٣٧١ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَوَّلُ زُمْرَةٍ تَلِجُ الْجَنَّةَ صُورَتُهُمْ عَلَى صُورَةِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ، لاَ يَبْصُقُونَ فِيهَا وَلاَ يَمْتَخِطُونَ وَلاَ يَتَغَوَّطُونَ، آنِيَتُهُمْ فِيهَا الذَّهَبُ، أَمْشَاطُهُمْ مِنَ الذَّهَبِ وَالْفِضَّةِ، وَمَجَامِرُهُمُ الأَلُوَّةُ، وَرَشْحُهُمُ الْمِسْكُ، وَلِكُلِّ وَاحِدٍ مِنْهُمْ زَوْجَتَانِ، يُرَى مُخُّ سُوقِهِمَا مِنْ وَرَاءِ اللَّحْمِ، مِنَ الْحُسْنِ، لاَ اخْتِلاَفَ بَيْنَهُمْ وَلاَ تَبَاغُضَ، قُلُوبُهُمْ قَلْبٌ وَاحِدٌ، يُسَبِّحُونَ اللَّهَ بُكْرَةً وَعَشِيًّا». [رواه البخاري: ٣٢٤٥]

**1371.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətə girəcək ilk zümrədə olan kimsələrin siması on dörd gecəlik ay kimi (gözəl və parlaq) olacaq. Cənnətdə onlar nə tüpürəcək, nə (burunlarından) selik ifraz edəcək, nə də təbii ehtiyaclarını rəf edəcəklər. (İşlətdikləri) qabları qızıldan, daraqları isə həm qızıldan, həm də gümüşdən olacaq. Buxurdanlarında[1] ud[2] (yan-

[1] Buxur: yandırıldıqda ətir saçan qatran, ağac qabığı və s. Buxurdan isə içində buxur yandırılan kiçik qabdır.

[2] Vətəni Hindistan sayılan, yandırılanda xoş iy verən ağac. Təbii ki, Cənnət udu bizim bildiyimiz uddan fərqli olacaq.

dırılacaq). Onların tərindən müşk qoxusu gələcək. Onlardan hər birinin iki zövcəsi olacaq. Bu qızlar elə gözəl və elə zərif olacaqlar ki, dərilərinin altından ayaq sümüyünün iliyi görünəcək. (Cənnət əhlinin) arasında nə bir ixtilaf, nə də kin-küdurət olacaq. Özləri də canbir qəlb olacaqlar. Onlar səhər-axşam Allahın şəninə təriflər deyəcəklər." (əl-Buxari, 3245)

١٣٧٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «أَوَّلُ زُمْرَةٍ تَدْخُلُ الْجَنَّةَ عَلَى صُورَةِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ، وَالَّذِينَ عَلَى إِثْرِهِمْ كَأَشَدِّ كَوْكَبٍ إِضَاءَةً، قُلُوبُهُمْ عَلَى قَلْبِ رَجُلٍ وَاحِدٍ، لاَ اخْتِلاَفَ بَيْنَهُمْ وَلاَ تَبَاغُضَ، لِكُلِّ امْرِئٍ مِنْهُمْ زَوْجَتَانِ، كُلُّ وَاحِدَةٍ مِنْهُمَا يُرَى مُخُّ سَاقِهَا مِنْ وَرَاءِ لَحْمِهَا مِنَ الْحُسْنِ، يُسَبِّحُونَ اللَّهَ بُكْرَةً وَعَشِيًّا، لاَ يَسْقَمُونَ وَلاَ يَمْتَخِطُونَ، وَلاَ يَبْصُقُونَ، آنِيَتُهُمُ الذَّهَبُ وَالْفِضَّةُ، وَأَمْشَاطُهُمُ الذَّهَبُ، وَقُودُ مَجَامِرِهِمُ الأُلُوَّةُ – قَالَ أَبُو الْيَمَانِ يَعْنِي الْعُودَ – وَرَشْحُهُمُ الْمِسْكُ». [رواه البخاري: ٣٢٤٦]

**1372.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətə girəcək ilk zümrədə olan kimsələrin siması on dörd gecəlik ay kimi (gözəl və parlaq) olacaq. Onların ardınca (ora) girənlər isə parlaq ulduz kimi olacaqlar. Onlar canbir qəlbdə yaşayacaq və aralarında nə bir ixtilaf, nə də kin-küdurət olacaq. Onlardan hər birinin iki zövcəsi olacaq. Bu qızlar elə gözəl və elə zərif olacaqlar ki, dərilərinin altından ayaq sümüyünün iliyi görünəcək. (Cənnət əhli) səhər-axşam Allahın şəninə təriflər deyəcək. Onlar nə xəstələnəcək, nə (burunlarından) selik ifraz edəcək, nə də tüpürəcəklər. Qabları qızıldan və gümüşdən, daraqları isə qızıldan olacaq. Buxurdanlarında ud yandırılacaq. Onların təri müşk iyi verəcək." (əl-Buxari, 3246)

١٣٧٣ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لَيَدْخُلَنَّ مِنْ أُمَّتِى سَبْعُونَ أَلْفًا – أَوْ سَبْعُمِائَةِ أَلْفٍ – لاَ يَدْخُلُ أَوَّلُهُمْ حَتَّى يَدْخُلَ آخِرُهُمْ، وُجُوهُهُمْ عَلَى صُورَةِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ». [رواه البخاري: ٣٢٤٧]

**1373.** Səhl ibn Səd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ümmətimdən yetmiş min, yaxud yeddi yüz min nəfər hamısı birdən (Cənnətə daxil olacaq). Onların üzü on dörd gecəlik ay kimi (gözəl və parlaq) olacaq." (əl-Buxari, 3247)

١٣٧٤ – عَنْ أَنَسٍ ﷺ قَالَ: أُهْدِىَ لِلنَّبِيِّ ﷺ جُبَّةُ سُنْدُسٍ، وَكَانَ يَنْهَى عَنِ الْحَرِيرِ، فَعَجِبَ النَّاسُ مِنْهَا، فَقَالَ: «وَالَّذِى نَفْسُ مُحَمَّدٍ بِيَدِهِ، لَمَنَادِيلُ سَعْدِ بْنِ مُعَاذٍ فِى الْجَنَّةِ أَحْسَنُ مِنْ هَذَا». [رواه البخاري: ٣٢٤٨]

**1374.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbərə ﷺ ipək cübbə hədiyyə etdilər. Halbuki o, (kişilərə) ipək geyməyi qadağan etmişdi. Camaat bu cübbənin zərifliyinə heyran qaldılar. Peyğəmbər ﷺ (onların təəccüblə baxdığını görüb) dedi: "Muhəmmədin canı Əlində olan Allaha and olsun ki, Səd ibn Muazın Cənnətdəki dəsmalı bundan da gözəldir." (əl-Buxari, 3248)

١٣٧٥ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ السَّاعِدِيِّ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَوْضِعُ سَوْطٍ فِى الْجَنَّةِ خَيْرٌ مِنَ الدُّنْيَا وَمَا فِيهَا». [رواه البخاري: ٣٢٥٠]

**1375.** Səhl ibn Səd əs-Saidi ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətdəki qamçı boyda yer, dünya və onun üzərindəkilərdən daha xeyirlidir." (əl-Buxari, 3250)

١٣٧٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنَّ فِي الْجَنَّةِ لَشَجَرَةً يَسِيرُ الرَّاكِبُ فِي ظِلِّهَا مِائَةَ سَنَةٍ، وَاقْرَءُوا إِنْ شِئْتُمْ: ﴿وَظِلٍّ مَّمْدُودٍ﴾. [رواه البخاري: ٣٢٥٢]

**1376.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətdə elə bir ağac vardır ki, atlı onun kölgəsində yüz il yol gedəcək, (amma onu qət edə bilməyəcək). İstəyirsinizsə, bu ayəni oxuyun: "uzanmış kölgəliklərdə..."[1] (əl-Buxari, 3252)

١٣٧٧ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنَّ أَهْلَ الْجَنَّةِ يَتَرَاءَوْنَ أَهْلَ الْغُرَفِ مِنْ فَوْقِهِمْ كَمَا يَتَرَاءَوْنَ الْكَوْكَبَ الدُّرِّيَّ الْغَابِرَ فِي الأُفُقِ مِنَ الْمَشْرِقِ أَوِ الْمَغْرِبِ، لِتَفَاضُلِ مَا بَيْنَهُمْ». قَالُوا يَا رَسُولَ اللَّهِ، تِلْكَ مَنَازِلُ الأَنْبِيَاءِ لاَ يَبْلُغُهَا غَيْرُهُمْ قَالَ: «بَلَى وَالَّذِي نَفْسِي بِيَدِهِ، رِجَالٌ آمَنُوا بِاللَّهِ وَصَدَّقُوا الْمُرْسَلِينَ». [رواه البخاري: ٣٢٥٦]

**1377.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnət sakinləri, bir-birilərindən üstün olduqları üçün (onların alt mərtəbədə olanları) üst mərtəbədəki[2] otaqlarda yerləşmiş möminləri, şərq və ya qərb istiqamətində axıb gedən parlaq ulduzu seyr etdikləri kimi seyr edəcəklər." (Əshabələr) dedilər: "Ya Rəsulullah, yəqin ki, bu peyğəmbərlərə ayrılmış yerdir və onlardan başqa heç kəs orada sakin ola bilməyəcək." Peyğəmbər ﷺ buyurdu: "Xeyr, canım Əlində olan Allaha and olsun ki, (bu otaqlar) Allaha iman gətirmiş və peyğəmbərləri təsdiq edən kimsələr üçündür." (əl-Buxari, 3256)

## 7-ci fəsil. Cəhənnəmin xüsusiyyətləri və onun məxluq olması haqqında

## ٧– باب: صِفَةُ النَّارِ وَأَنَّهَا مَخْلُوقَةٌ

١٣٧٨ – عَنْ عَائِشَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «الْحُمَّى مِنْ فَيْحِ جَهَنَّمَ، فَأَبْرِدُوهَا بِالْمَاءِ». [رواه البخاري: ٣٢٦٣]

**1378.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qızdırma Cəhənnəm istisinin (bir hissəsidir). Odur ki, onu su ilə soyudun!" (əl-Buxari, 3263)

١٣٧٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «نَارُكُمْ جُزْءٌ مِنْ سَبْعِينَ جُزْءًا مِنْ نَارِ جَهَنَّمَ». قِيلَ يَا رَسُولَ اللَّهِ، إِنْ كَانَتْ لَكَافِيَةً. قَالَ: «فُضِّلَتْ عَلَيْهِنَّ بِتِسْعَةٍ وَسِتِّينَ جُزْءًا، كُلُّهُنَّ مِثْلُ حَرِّهَا». [رواه البخاري: ٣٢٦٥]

**1379.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizin istifadə etdiyiniz od Cəhənnəm odunun yetmiş hissəsindən biridir." (Bir nəfər) dedi: "Ya Rəsulullah, elə bu da bəs edər!" Peyğəmbər ﷺ dedi: "Cəhənnəm odu dünyadakı oddan altmış doqquz dəfə üstündür. Həm də bunların hər biri (gördüyünüz) od qədər yandırıb-yaxandır." (əl-Buxari, 3265)

---

[1] "əl-Vaqiə" surəsi, 30.

[2] Digər bir hədisdə Peyğəmbər ﷺ demişdir: "Cənnətdə yüz mərtəbə vardır. Bu mərtəbələr arasındakı məsafə yerlə göy arasındakı məsafə qədərdir. Firdovs onun ən yüksək mərtəbəsidir. Oradan Cənnətin dörd çayı axır. Onun üstündə isə Ərş yerləşir. Odur ki, Allahdan dilədikdə Firdovs bağını diləyin!" (Sünən ət-Tirmizi)..

١٣٨٠ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «يُجَاءُ بِالرَّجُلِ يَوْمَ الْقِيَامَةِ فَيُلْقَى فِي النَّارِ، فَتَنْدَلِقُ أَقْتَابُهُ فِي النَّارِ، فَيَدُورُ كَمَا يَدُورُ الْحِمَارُ بِرَحَاهُ، فَيَجْتَمِعُ أَهْلُ النَّارِ عَلَيْهِ، فَيَقُولُونَ أَيْ فُلاَنُ، مَا شَأْنُكَ أَلَيْسَ كُنْتَ تَأْمُرُنَا بِالْمَعْرُوفِ وَتَنْهَانَا عَنِ الْمُنْكَرِ قَالَ كُنْتُ آمُرُكُمْ بِالْمَعْرُوفِ وَلاَ آتِيهِ، وَأَنْهَاكُمْ عَنِ الْمُنْكَرِ وَآتِيهِ». [رواه البخاري: ٣٢٦٧]

**1380.** Rəvayət edilir ki, Usamə ibn Zeyd ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qiyamət günü bir nəfər gətirilib Cəhənnəm oduna atılacaq. Onun bağırsaqları atəşin içinə töküləcək və o, dəyirmanın ətrafında fırlanan uzunqulaq kimi fırlanacaq. Cəhənnəm sakinləri onun başına yığışıb deyəcəklər: "Ay filankəs! Niyə bu kökə düşmüsən? Məgər sən bizə yaxşı işlər görməyi buyurub pis əməlləri qadağan etmirdinmi?" O deyəcək: "Mən sizə yaxşı işlər görməyi buyururdum, lakin özüm buna əməl etmirdim, pis əməlləri qadağan edirdim, amma özüm o işləri görürdüm." (əl-Buxari, 3267)

## 8-ci fəsil. İblisin xüsusiyyətləri və onun əsgərləri

## ٨– باب: صِفَةُ إِبْلِيسَ وَجُنُودِهِ

١٣٨١ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: سُحِرَ النَّبِيُّ ﷺ حَتَّى كَانَ يُخَيَّلُ إِلَيْهِ أَنَّهُ يَفْعَلُ الشَّيْءَ وَمَا يَفْعَلُهُ، حَتَّى كَانَ ذَاتَ يَوْمٍ دَعَا وَدَعَا، ثُمَّ قَالَ: «أَشَعَرْتِ أَنَّ اللَّهَ أَفْتَانِي فِيمَا فِيهِ شِفَائِي أَتَانِي رَجُلاَنِ، فَقَعَدَ أَحَدُهُمَا عِنْدَ رَأْسِي وَالآخَرُ عِنْدَ رِجْلَيَّ، فَقَالَ أَحَدُهُمَا لِلآخَرِ مَا وَجَعُ الرَّجُلِ قَالَ مَطْبُوبٌ. قَالَ وَمَنْ طَبَّهُ قَالَ لَبِيدُ بْنُ الأَعْصَمِ. قَالَ فِي مَاذَا قَالَ فِي مُشُطٍ وَمُشَاقَةٍ وَجُفِّ طَلْعَةٍ ذَكَرٍ. قَالَ فَأَيْنَ هُوَ قَالَ فِي بِئْرِ ذَرْوَانَ». فَخَرَجَ إِلَيْهَا النَّبِيُّ ﷺ ثُمَّ رَجَعَ فَقَالَ لِعَائِشَةَ حِينَ رَجَعَ: «نَخْلُهَا كَأَنَّهَا رُءُوسُ الشَّيَاطِينِ». فَقُلْتُ اسْتَخْرَجْتَهُ فَقَالَ «لاَ أَمَّا أَنَا فَقَدْ شَفَانِي اللَّهُ، وَخَشِيتُ أَنْ يُثِيرَ ذَلِكَ عَلَى النَّاسِ شَرًّا، ثُمَّ دُفِنَتِ الْبِئْرُ». [رواه البخاري: ٣٢٦٨]

**1381.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbərə ﷺ sehr edildi. İş o yerə gəlib çatmışdı ki, həqiqətdə etmədiyi bir işi etdiyi onun xəyalına girirdi. Nəhayət, bir gün o, uzun-uzadı dua etdikdən sonra (mənə) dedi: "Bilirsənmi, Allah mənə bu xəstəlikdən sağalmaq üçün yol göstərdi[1]. (Yuxuda) mənim yanıma iki nəfər gəldi. Onlardan biri mənim baş tərəfimdə, digəri isə ayaq tərəfimdə oturdu və öz aralarında (mənim haqqımda) danışmağa başladılar:

– Bunun dərdi nədir?
– Ona sehr edilmişdir.
– Sehri edən kimdir?
– Ləbid ibn əl-Əsam.
– O, sehri nə ilə etmişdir?
– Daraq, darananda saç-saqqaldan tökülən tük və erkək xurmanın tozcuğu ilə.
– Yaxşı bəs o cadu-pitik indi haradadır?
– Zərvan quyusunda.

---

[1] Digər rəvayətdə Aişə ﷺ demişdir: "Peyğəmbər ﷺ hər gecə yatağına uzandıqda əllərini cütləşdirib onların içinə üfürər, sonra ora "əl-İxlas", "əl-Fələq" və "ən-Nas" surələrini oxuyar, daha sonra isə əllərini baş və üz nahiyəsindən başlayaraq, bacardığı qədər bədəninin hər yerinə sürtərdi. Beləcə, o, bunu üç dəfə təkrar edərdi" (Səhih əl-Buxari).

Bundan sonra Peyğəmbər ﷺ quyunun yanına getdi. Sonra geri qayıdıb mənə dedi: "(O quyunun suyu ilə suvarılmış) xurma ağaclarının başı şeytan başlarına bənzəyir." Mən soruşdum: "Cadunu çıxarda bildinmi?" Dedi: "Xeyr, (çıxartmadım)! Çünki Allah artıq mənə şəfa vermişdir. Lakin mən onun insanlara təsir göstərə biləcəyindən ehtiyat etdim." Elə buna görə də həmin quyu (torpaqla) dolduruldu." (əl-Buxari, 3268)

١٣٨٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «يَأْتِي الشَّيْطَانُ أَحَدَكُمْ فَيَقُولُ مَنْ خَلَقَ كَذَا مَنْ خَلَقَ كَذَا حَتَّى يَقُولَ مَنْ خَلَقَ رَبَّكَ فَإِذَا بَلَغَهُ فَلْيَسْتَعِذْ بِاللَّهِ، وَلْيَنْتَهِ». [رواه البخاري: ٣٢٧٦]

**1382.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Şeytan sizdən birinizin yanına gəlib: "Filan şeyi kim yaradıb? Filan şeyi kim yaradıb?"– deyə (ayrı-ayrı suallar verməyə başlayır). Axırda da: "Rəbbini kim yaradıb?"– deyə (qəlbinizə şübhə salır). Belə olduqda qoy həmin adam Allaha sığınsın[1] və bir daha bu haqda düşünməsin." (əl-Buxari, 3276)

١٣٨٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يُشِيرُ إِلَى الْمَشْرِقِ فَقَالَ: «هَا إِنَّ الْفِتْنَةَ هَا هُنَا إِنَّ الْفِتْنَةَ هَا هُنَا مِنْ حَيْثُ يَطْلُعُ قَرْنُ الشَّيْطَانِ». [رواه البخاري: ٣٢٧٩]

**1383.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərin ﷺ (əli ilə) şərqə tərəf işarə edib belə dediyinin şahidi oldum: "Fitnə bax oradan (baş qaldıracaq), fitnə bax oradan – şeytanın buynuzu çıxdığı yerdən (baş qaldıracaq)." (əl-Buxari, 3279)

١٣٨٤ – عَنْ جَابِرٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا اسْتَجْنَحَ اللَّيْلُ – أَوْ كَانَ جُنْحُ اللَّيْلِ – فَكُفُّوا صِبْيَانَكُمْ، فَإِنَّ الشَّيَاطِينَ تَنْتَشِرُ حِينَئِذٍ، فَإِذَا ذَهَبَ سَاعَةٌ مِنَ الْعِشَاءِ فَحُلُّوهُمْ وَأَغْلِقْ بَابَكَ، وَاذْكُرِ اسْمَ اللَّهِ، وَأَطْفِئْ مِصْبَاحَكَ، وَاذْكُرِ اسْمَ اللَّهِ، وَأَوْكِ سِقَاءَكَ، وَاذْكُرِ اسْمَ اللَّهِ، وَخَمِّرْ إِنَاءَكَ، وَاذْكُرِ اسْمَ اللَّهِ، وَلَوْ تَعْرُضُ عَلَيْهِ شَيْئًا». [رواه البخاري: ٣٢٨٠]

**1384.** Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qaş qaraldığı zaman uşaqlarınızı (bayıra) buraxmayın. (Çünki bu vaxt) şeytanlar (hər tərəfə) yayılırlar. Gecədən bir müddət keçdikdən sonra isə onları buraxa bilərsiniz. (Gecələr) "Bismillah" deyərək (evinin) qapısını bağla! "Bismillah" deyərək lampanı söndür! "Bismillah" deyərək su tuluqlarının ağzını bağla!" "Bismillah" deyərək hər nə ilə olursa, olsun qab-qacağın ağzını ört!" (əl-Buxari, 3280)

١٣٨٥ – عَنْ سُلَيْمَانَ بْنِ صُرَدٍ ﷺ قَالَ: كُنْتُ جَالِسًا مَعَ النَّبِيِّ ﷺ وَرَجُلَانِ يَسْتَبَّانِ، فَأَحَدُهُمَا احْمَرَّ وَجْهُهُ وَانْتَفَخَتْ أَوْدَاجُهُ، فَقَالَ النَّبِيُّ ﷺ: «إِنِّي لَأَعْلَمُ كَلِمَةً لَوْ قَالَهَا ذَهَبَ عَنْهُ مَا يَجِدُ، لَوْ قَالَ أَعُوذُ بِاللَّهِ مِنَ الشَّيْطَانِ. ذَهَبَ عَنْهُ مَا يَجِدُ». فَقَالُوا لَهُ إِنَّ النَّبِيَّ ﷺ قَالَ: «تَعَوَّذْ بِاللَّهِ مِنَ الشَّيْطَانِ». فَقَالَ وَهَلْ بِي جُنُونٌ. [رواه البخاري: ٣٢٨٢]

**1385.** Rəvayət edilir ki, Suleyman ibn Surad ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərin ﷺ yanında ikən iki nəfər bir-birilə söyüşməyə başladı. (Qəzəbdən) onlardan birinin üzü qızardı və boyun damarları şişdi. Peyğəmbər ﷺ (ona baxıb)

[1] Məsələn: "Əuzu billahi minəş-şeytanir-rəcim"- desin.

dedi: "Mən elə bir kəlmə bilirəm ki, əgər o həmin kəlməni desə, qəzəb hissi ondan gedər! Əgər o: "Əuzu billəhi minəş-şeytan!"[1] desə, qəzəbi soyuyar. Əshabələr həmin adama dedilər: "Peyğəmbər ﷺ (sənə) şeytandan Allaha sığınmağı buyurur." Adam dedi: "Məgər mən dəliyəm?!" (əl-Buxari, 3282)

١٣٨٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «التَّثَاؤُبُ مِنَ الشَّيْطَانِ، فَإِذَا تَثَاءَبَ أَحَدُكُمْ فَلْيَرُدَّهُ مَا اسْتَطَاعَ، فَإِنَّ أَحَدَكُمْ إِذَا قَالَ هَا. ضَحِكَ الشَّيْطَانُ». [رواه البخاري: ٣٢٨٩]

**1386.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əsnəmək şeytandandır. Birinizi əsnəmək tutsa, qoy bacardığı qədər onun qarşısını alsın. Çünki o (əsnəyib): "Haaah"– etdikdə şeytan ona gülür." (əl-Buxari, 3289)

١٣٨٧ – عَنْ أَبِي قَتَادَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «الرُّؤْيَا الصَّالِحَةُ مِنَ اللَّهِ، وَالْحُلُمُ مِنَ الشَّيْطَانِ فَإِذَا حَلَمَ أَحَدُكُمْ حُلُمًا يَخَافُهُ فَلْيَبْصُقْ عَنْ يَسَارِهِ، وَلْيَتَعَوَّذْ بِاللَّهِ مِنْ شَرِّهَا، فَإِنَّهَا لاَ تَضُرُّهُ». [رواه البخاري: ٣٢٩٢]

**1387.** Əbu Qətadə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Gözəl yuxu Allahdandır. Xoşagəlməz yuxu isə şeytandandır. Əgər biriniz xoşagəlməz yuxu görüb əndişəyə düşərsə, qoy sol tərəfinə yüngülcə tüpürsün və bu yuxunun şərindən Allaha sığınsın[2]. Belə etsə, həqiqətən də, bu yuxunun ona heç bir zərəri dəyməz." (əl-Buxari, 3292)

١٣٨٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِذَا اسْتَيْقَظَ – أُرَاهُ – أَحَدُكُمْ مِنْ مَنَامِهِ فَتَوَضَّأَ فَلْيَسْتَنْثِرْ ثَلاَثًا، فَإِنَّ الشَّيْطَانَ يَبِيتُ عَلَى خَيْشُومِهِ». [رواه البخاري: ٣٢٩٥]

**1388.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz yuxudan oyanıb dəstəmaz aldığı zaman burnunun içini üç dəfə yusun. Çünki şeytan burun deşiyində gecələyir." (əl-Buxari, 3295)

## ٩– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَبَثَّ فِيهَا مِن كُلِّ دَآبَّةٍ﴾

## 9-cu fəsil. Uca Allahın: "...*Onun* bütün heyvanatı *yer üzünə* yaymasında..."[3] sözü

١٣٨٩ – عَنْ ابْنِ عُمَرَ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَخْطُبُ عَلَى الْمِنْبَرِ يَقُولُ: «اقْتُلُوا الْحَيَّاتِ، وَاقْتُلُوا ذَا الطُّفْيَتَيْنِ وَالأَبْتَرَ، فَإِنَّهُمَا يَطْمِسَانِ الْبَصَرَ، وَيَسْتَسْقِطَانِ الْحَبَلَ».
قَالَ عَبْدُ اللَّهِ فَبَيْنَا أَنَا أُطَارِدُ حَيَّةً لأَقْتُلَهَا فَنَادَانِي أَبُو لُبَابَةَ لاَ تَقْتُلْهَا. فَقُلْتُ إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَدْ أَمَرَ بِقَتْلِ الْحَيَّاتِ. قَالَ إِنَّهُ نَهَى بَعْدَ ذَلِكَ عَنْ ذَوَاتِ الْبُيُوتِ، وَهِيَ الْعَوَامِرُ. [رواه البخاري: ٣٢٩٧–٣٢٩٨]

**1389.** Rəvayət edilir ki, ibn Ömər ﷺ Peyğəmbərin ﷺ minbərdə xütbə verərkən belə dediyini eşitmişdir: "İlanları öldürün! Belində iki zolağı olan ilanları,

[1] Tərcüməsi: Şeytandan Allaha sığınıram!

[2] Bu xüsusda rəvayət edilmiş hədisləri cəm edib demək olar ki, qarmaqarışıq yuxu görüb təşviş içində yuxudan oyanan adam üç dəfə sol tərəfinə tüpürməli, üç dəfə şeytandan və gördüyünün şərindən Allaha sığınmalı, bu yuxunu heç kəsə danışmamalı və digər böyrü üstə çevrilməlidir.

[3] "əl-Bəqərə" surəsi, 164 və "Loğman" surəsi, 10.

habelə quyruğukəsik ilanları öldürün! Çünki bu ikisi adamın gözlərini kor edir və hamilə qadının bətnindəki uşağı salır."

Abdullah ibn Ömər demişdir: "Mən öldürmək üçün bir ilanın dalınca düşdüyüm zaman Əbu Lubabə məni səsləyib: "Onu öldürmə!"– dedi. Dedim: "Axı Peyğəmbər ﷺ ilanları öldürməyi əmr etmişdir?!" Əbu Lubabə dedi: "Lakin bu əmrindən sonra o, ev ilanlarını öldürməyi qadağan etdi."

Bu (ilanlara) "Əvamir" deyilir. (əl-Buxari, 3297-3298)

## 10-cu fəsil. Müsəlman üçün ən xeyirli mal onun dağlar başında otardığı qoyunlardır

## ١٠– باب: خَيْرُ مَالِ الْمُسْلِمِ غَنَمٌ يَتْبَعُ بِهَا شَعَفَ الْجِبَالِ

١٣٩٠ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «رَأْسُ الْكُفْرِ نَحْوَ الْمَشْرِقِ، وَالْفَخْرُ وَالْخُيَلاَءُ فِى أَهْلِ الْخَيْلِ وَالإِبِلِ، وَالْفَدَّادِينَ أَهْلِ الْوَبَرِ، وَالسَّكِينَةُ فِى أَهْلِ الْغَنَمِ». [رواه البخاري: ٣٣٠١]

**1390.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Küfrün əsas mənbəyi şərq istiqamətindədir. Lovğalıq və təkəbbürlük (adətən) at ilxısına və dəvə sürüsünə sahib olan kimsələrdə, habelə kobud danışığı olan bədəvilərdə özünü büruzə verir. Qoyun sürüsünə sahib olan kimsələr isə dinc adam olurlar." (əl-Buxari, 3301)

١٣٩١ – عَنْ عُقْبَةَ بْنِ عَمْرٍو أَبِى مَسْعُودٍ ﷺ قَالَ: أَشَارَ رَسُولُ اللَّهِ ﷺ بِيَدِهِ نَحْوَ الْيَمَنِ فَقَالَ: «الإِيمَانُ يَمَانٍ هَا هُنَا، أَلاَ إِنَّ الْقَسْوَةَ وَغِلَظَ الْقُلُوبِ فِى الْفَدَّادِينَ عِنْدَ أُصُولِ أَذْنَابِ الإِبِلِ، حَيْثُ يَطْلُعُ قَرْنَا الشَّيْطَانِ فِى رَبِيعَةَ وَمُضَرَ». [رواه البخاري: ٣٣٠٢]

**1391.** Rəvayət edilir ki, Uqbə ibn Amr Əbu Məsud ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ əli ilə Yəmənə tərəf işarə edib dedi: "İman bax orada – Yəməndədir.[1] Daşürəklilik və qabalıq isə kobud danışığı ilə seçilən, dəvələrinin quyruğundan yapışmış[2] bədəvilərə aiddir. (Bu xasiyyətlər isə) şeytanın iki buynuzu çıxan[3] yerdə – Rəbiə və Mudər (qəbilələrində) özünü büruzə verir." (əl-Buxari, 3302)

١٣٩٢ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ النَّبِىَّ ﷺ قَالَ: «إِذَا سَمِعْتُمْ صِيَاحَ الدِّيَكَةِ فَاسْأَلُوا اللَّهَ مِنْ فَضْلِهِ، فَإِنَّهَا رَأَتْ مَلَكًا، وَإِذَا سَمِعْتُمْ نَهِيقَ الْحِمَارِ فَتَعَوَّذُوا بِاللَّهِ مِنَ الشَّيْطَانِ، فَإِنَّهُ رَأَى شَيْطَانًا». [رواه البخاري: ٣٣٠٣]

**1392.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Xoruz banı eşitdiyiniz zaman Allahdan Onun lütfünü diləyin, çünki (həmin vaxt) xoruz mələk görmüşdür. Eşşək anqırtısı eşitdiyiniz zaman isə şeytandan Allaha sığının, çünki (bu vaxt) eşşək şeytan görmüşdür." (əl-Buxari, 3303)

---

[1] Peyğəmbər ﷺ demək istəmişdir ki, yəmənlilər başqalarına nisbətdə daha tez imana gəlirlər.

[2] Burada Peyğəmbər ﷺ başları dəvələrinə qarışmış, getdikcə kobudlaşan insanları nəzərdə tutur.

[3] Xəttabi demişdir: Burada "şeytanın iki buynuz"u yaramaz işlərə məsəl çəkilmişdir.

١٣٩٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «فُقِدَتْ أُمَّةٌ مِنْ بَنِي إِسْرَائِيلَ لاَ يُدْرَى مَا فَعَلَتْ، وَإِنِّي لاَ أُرَاهَا إِلاَّ الْفَارَ إِذَا وُضِعَ لَهَا أَلْبَانُ الإِبِلِ لَمْ تَشْرَبْ، وَإِذَا وُضِعَ لَهَا أَلْبَانُ الشَّاءِ شَرِبَتْ». فَحَدَّثْتُ كَعْبًا فَقَالَ: أَنْتَ سَمِعْتَ النَّبِيَّ ﷺ يَقُولُهُ قُلْتُ نَعَمْ. قَالَ لِي مِرَارًا. فَقُلْتُ أَفَأَقْرَأُ التَّوْرَاةَ؟ [رواه البخاري: ٣٣٠٥]

**1393.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bir zaman) İsrail oğullarından bir dəstə yox olmuşdur. Onların başlarına nələr gəldiyini heç kəs bilmir. Mən isə onların siçana döndüyünü güman edirəm. Belə ki, siçana dəvə südü verilsə, içməz, qoyun südünü isə içər.[1]"

(Əbu Hureyra dedi): "Mən bu hədisi Kəbə danışdıqda o (məndən) soruşdu: "Sən Peyğəmbərin ﷺ bu əhvalatı danışdığını eşitmisənmi?" Mən: "Bəli!"-dedim. O, bu sualı dəfələrlə təkrar etdikdə mən dedim: "Məgər mən Tövrat oxuyuram?![2]" (əl-Buxari, 3305)

## 11-ci fəsil. Birinizin (su və s.) içdiyi (qaba) milçək düşsə, qoy onu basıb (qabın) içinə salsın, çünki onun qanadlarından birində xəstəlik, digərində isə bunun dərmanı vardır

## ١١– باب: إِذَا وَقَعَ الذُّبَابُ فِي شَرَابِ أَحَدِكُمْ فَلْيَغْمِسْهُ، فَإِنَّ فِي إِحْدَى جَنَاحَيْهِ دَاءً وَفِي الأُخْرَى شِفَاءً

١٣٩٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «إِذَا وَقَعَ الذُّبَابُ فِي شَرَابِ أَحَدِكُمْ فَلْيَغْمِسْهُ، ثُمَّ لِيَنْزِعْهُ، فَإِنَّ فِي إِحْدَى جَنَاحَيْهِ دَاءً وَالأُخْرَى شِفَاءً». [رواه البخاري: ٣٣٢٠]

**1394.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Birinizin (su və s.) içdiyi (qaba) milçək düşsə, qoy onu basıb (qabın) içinə salsın, sonra da çıxarıb (kənara atsın). Çünki onun qanadlarından birində xəstəlik, digərində isə bunun dərmanı vardır." (əl-Buxari, 3320)

١٣٩٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: «غُفِرَ لامْرَأَةٍ مُومِسَةٍ مَرَّتْ بِكَلْبٍ عَلَى رَأْسِ رَكِيٍّ يَلْهَثُ، قَالَ كَادَ يَقْتُلُهُ الْعَطَشُ، فَنَزَعَتْ خُفَّهَا، فَأَوْثَقَتْهُ بِخِمَارِهَا، فَنَزَعَتْ لَهُ مِنَ الْمَاءِ، فَغُفِرَ لَهَا بِذَلِكَ». [رواه البخاري: ٣٣٢١]

**1395.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Quyunun başında durub ləhləyən, susuzluqdan az qala öləcək bir itin yanından keçən pozğun bir qadının (günahları) bağışlanmışdır. Qadın ayaqqabısını çıxardıb örpəyinə bağladıqdan sonra onu quyuya sallayıb it üçün su çıxartmış və bu səbəbdən də (onun günahları) bağışlanmışdır." (əl-Buxari, 3321)

---

[1] Vaxtı ilə İsrailin ﷺ özünə dəvə ətini və südünü haram buyurması Peyğəmbərimizi ﷺ belə deməyə vadar etmişdir.

[2] Əbu Hureyra ﷺ bununla demək istəmişdir ki, o, rəvayət etdiyi hədisi Tövratdan yox, məhz Peyğəmbərdən ﷺ öyrənmişdir.

# ٦٠ – كِتَابُ أَحَادِيثِ الأَنْبِيَاءِ

# 60 – Peyğəmbərlərə dair hədislər kitabı

## ١ – باب: خَلْقِ آدَمَ ﷺ وَذُرِّيَّتِه

## 1-ci fəsil. Adəmin ﷺ və onun zürriyyətinin xəlq edilməsi

١٣٩٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «خَلَقَ اللَّهُ آدَمَ وَطُولُهُ سِتُّونَ ذِرَاعًا، ثُمَّ قَالَ اذْهَبْ فَسَلِّمْ عَلَى أُولَئِكَ مِنَ الْمَلاَئِكَةِ، فَاسْتَمِعْ مَا يُحَيُّونَكَ، تَحِيَّتُكَ وَتَحِيَّةُ ذُرِّيَّتِكَ. فَقَالَ السَّلاَمُ عَلَيْكُمْ. فَقَالُوا السَّلاَمُ عَلَيْكَ وَرَحْمَةُ اللَّهِ. فَزَادُوهُ وَرَحْمَةُ اللَّهِ. فَكُلُّ مَنْ يَدْخُلُ الْجَنَّةَ عَلَى صُورَةِ آدَمَ، فَلَمْ يَزَلِ الْخَلْقُ يَنْقُصُ حَتَّى الآنَ». [رواه البخاري: ٣٣٢٦]

**1396.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah Adəmi boyu altmış ərəş[1] uzunluğunda yaratdı. Sonra buyurdu: "Get oradakı mələklərə salam ver və dinlə gör sənin salamını necə alacaqlar. Çünki bu həm sənin, həm də sənin zürriyyətinin salamıdır." (Adəm) onlara: "Əssəlamu aleykum![2]"– dedi. Onlar da: "Əssəlamu aleykə və rahmətullah![3]"– deyib, buna "və rahmətullah" kəlməsini əlavə etdilər. Cənnətə girəcək hər kəs (ora) Adəmin surətində girəcəkdir. (Məlumunuz olsun ki,) indiyə qədər insanların xilqəti naqisləşməkdədir" (əl-Buxari, 3326)

١٣٩٧ – عَنْ أَنَسٍ ﷺ قَالَ: بَلَغَ عَبْدَ اللَّهِ بْنَ سَلاَمٍ مَقْدَمُ رَسُولِ اللَّهِ ﷺ الْمَدِينَةَ، فَأَتَاهُ، فَقَالَ إِنِّي سَائِلُكَ عَنْ ثَلاَثٍ لاَ يَعْلَمُهُنَّ إِلاَّ نَبِيٌّ، مَا أَوَّلُ أَشْرَاطِ السَّاعَةِ وَمَا أَوَّلُ طَعَامٍ يَأْكُلُهُ أَهْلُ الْجَنَّةِ وَمِنْ أَيِّ شَيْءٍ يَنْزِعُ الْوَلَدُ إِلَى أَبِيهِ وَمِنْ أَيِّ شَيْءٍ يَنْزِعُ إِلَى أَخْوَالِهِ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «خَبَّرَنِي بِهِنَّ آنِفًا جِبْرِيلُ». قَالَ فَقَالَ عَبْدُ اللَّهِ ذَاكَ عَدُوُّ الْيَهُودِ مِنَ الْمَلاَئِكَةِ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَمَّا أَوَّلُ أَشْرَاطِ السَّاعَةِ فَنَارٌ تَحْشُرُ النَّاسَ مِنَ الْمَشْرِقِ إِلَى الْمَغْرِبِ. وَأَمَّا أَوَّلُ طَعَامٍ يَأْكُلُهُ أَهْلُ الْجَنَّةِ فَزِيَادَةُ كَبِدِ حُوتٍ. وَأَمَّا الشَّبَهُ فِي الْوَلَدِ فَإِنَّ الرَّجُلَ إِذَا غَشِيَ الْمَرْأَةَ فَسَبَقَهَا مَاؤُهُ كَانَ الشَّبَهُ لَهُ، وَإِذَا سَبَقَ مَاؤُهَا كَانَ الشَّبَهُ لَهَا». قَالَ أَشْهَدُ أَنَّكَ رَسُولُ اللَّهِ. ثُمَّ قَالَ يَا رَسُولَ اللَّهِ إِنَّ الْيَهُودَ قَوْمٌ بُهُتٌ، إِنْ عَلِمُوا بِإِسْلاَمِي قَبْلَ أَنْ تَسْأَلَهُمْ بَهَتُونِي عِنْدَكَ، فَجَاءَتِ الْيَهُودُ وَدَخَلَ عَبْدُ اللَّهِ الْبَيْتَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَيُّ رَجُلٍ فِيكُمْ عَبْدُ اللَّهِ بْنُ سَلاَمٍ». قَالُوا أَعْلَمُنَا وَابْنُ أَعْلَمِنَا وَأَخْيَرُنَا وَابْنُ أَخْيَرِنَا. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَفَرَأَيْتُمْ إِنْ أَسْلَمَ عَبْدُ اللَّهِ». قَالُوا أَعَاذَهُ اللَّهُ مِنْ ذَلِكَ. فَخَرَجَ عَبْدُ اللَّهِ إِلَيْهِمْ فَقَالَ أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ. فَقَالُوا شَرُّنَا وَابْنُ شَرِّنَا. وَوَقَعُوا فِيهِ. [رواه البخاري: ٣٣٢٩]

**1397.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Abdullah ibn Səlam ﷺ Peyğəmbərin ﷺ Mədinəyə gəldiyini eşitdikdə onun yanına gəlib dedi: "Səndən peyğəmbərlərdən başqa kimsənin bilmədiyi üç şey barəsində soruşmaq istəyirəm. Qiyamət saatının ilk əlaməti nədir? Cənnət əhlinin ilk yediyi yemək nə olacaq? Uşaq hansı səbəbdən atasına oxşayır və hansı səbəbdən dayılarına oxşayır?

[1] 311-ci hədisin qeydlərinə bax.
[2] Tərcüməsi: Sizə salam olsun!
[3] Tərcüməsi: Sənə salam olsun və Allahın rəhməti yetişsin!

Peyğəmbər ﷺ buyurdu: "Az öncə Cəbrail bu haqda mənə xəbər verdi!" (Bu adı eşidəndə) Abdullah ibn Səlam dedi: "Bu ki yəhudilərin (mələklər arasında yeganə) düşmən saydığı mələkdir." Peyğəmbər ﷺ buyurdu: "Qiyamət saatının ilk əlamətinə gəlincə, (bu,) insanları şərqdən qərbə doğru qovub (məhşərə) toplayacaq oddur. Cənnət əhlinin ilk yediyi yeməyə gəldikdə isə, (bu,) balinanın qara ciyərinin ən dadlı hissəsi olacaq. O ki qaldı uşağın oxşarlığına, (bil ki,) kişi öz zövcəsi ilə yaxınlıq etdikdə (onun belindən gələn) su (qadının köks sümüyündən axan suyu) üstələsə uşaq atasına, əks təqdirdə isə anasına oxşayar." (Abdullah ibn Səlam) dedi: "Mən şəhadət verirəm ki, sən Allahın Rəsulusan!" Sonra davam edib dedi: "Ya Rəsulullah! Həqiqətən, yəhudilər böhtan atan adamlardır. Əgər sən onlardan (mənim barəmdə) soruşmamışdan əvvəl mənim müsəlman olduğumu bilsələr, elə buradaca mənə iftira yaxacaqlar."

Sonra yəhudilər (Peyğəmbərin ﷺ yanına) gəldilər və Abdullah ibn Səlam (onları görüb) evə girdi. Peyğəmbər ﷺ (onlardan) soruşdu: "Sizin bu Abdullah ibn Səlam necə adamdır?" Onlar dedilər: "O, bizim ən ağıllımız və ən ağıllımızın oğludur, habelə ən xeyirlimiz və ən xeyirlimizin oğludur." Peyğəmbər ﷺ dedi: "Abdullah müsəlman olsa, buna sözünüz nə olacaq?" Onlar dedilər: "Belə bir iş görməkdən Allah onu qorusun!" Bu vaxt Abdullah onların qarşısına çıxıb dedi: "Mən şahidlik edirəm ki, Allahdan başqa məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun elçisidir." (Bunu eşidəndə) yəhudilər: "O, bizim ən pisimiz və ən pisimizin oğludur"– dedilər və onun barəsində artıq-əskik danışdılar." (əl-Buxari, 3329)

١٣٩٨ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِىِّ ﷺ قَالَ: «لَوْلاَ بَنُو إِسْرَائِيلَ لَمْ يَخْنَزِ اللَّحْمُ، وَلَوْلاَ حَوَّاءُ لَمْ تَخُنْ أُنْثَى زَوْجَهَا». [رواه البخاري: ٣٣٣٠]

**1398.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əgər İsrail oğulları olmasaydı[1], ət xarab olmazdı, və əgər Həvva olmasaydı[2], heç bir qadın ərinə xəyanət etməzdi." (əl-Buxari, 3330)

١٣٩٩ – عَنْ أَنَسٍ رضي الله عنه يَرْفَعُهُ: «أَنَّ اللَّهَ يَقُولُ لأَهْوَنِ أَهْلِ النَّارِ عَذَابًا لَوْ أَنَّ لَكَ مَا فِى الأَرْضِ مِنْ شَىْءٍ كُنْتَ تَفْتَدِى بِهِ قَالَ نَعَمْ. قَالَ فَقَدْ سَأَلْتُكَ مَا هُوَ أَهْوَنُ مِنْ هَذَا وَأَنْتَ فِى صُلْبِ آدَمَ أَنْ لاَ تُشْرِكَ بِى. فَأَبَيْتَ إِلاَّ الشِّرْكَ». [رواه البخاري: ٣٣٣٤]

**1399.** Ənəs رضي الله عنه Peyğəmbərdən ﷺ belə rəvayət etmişdir: "(Qiyamət günü) Allah Cəhənnəmdə ən yüngül əzaba məruz qalan bir kimsəyə deyəcək: "Əgər dünyada olan hər şey sənin olsaydı, onu (əzabdan xilas olmağın üçün) fidyə verərdinmi?" O: "Bəli!"– deyə cavab verəcək. Onda Allah buyuracaq: "Sən hələ Adəmin belində ikən Mən səndən bundan daha yüngül olanı – Mənə şərik qoşmamağı – tələb etmişdim. Sən isə məhz şərik qoşmağı tərcih etdin." (əl-Buxari, 3334)

---

[1] Vaxtı ilə Allah İsrail oğullarına buyurmuşdur ki, yemək hazırladıqda ancaq təzə ətdən istifadə etsinlər. Lakin onlar buna məhəl qoymayıb əti saxlamağa başladılar.

[2] Bəşəriyyətin anası sayılan Həvva عليها السلام Cənnətdə ikən Adəmi عليه السلام dilə tutub onu qadağan olmuş ağacın meyvəsindən dərməyə təşviq etmiş, beləliklə də, ona xəyanət etmişdir.

١٤٠٠ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لاَ تُقْتَلُ نَفْسٌ ظُلْمًا إِلاَّ كَانَ عَلَى ابْنِ آدَمَ الأَوَّلِ كِفْلٌ مِنْ دَمِهَا، لأَنَّهُ أَوَّلُ مَنْ سَنَّ الْقَتْلَ». [رواه البخاري: ٣٣٣٥]

**1400.** Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Haqsız yerə qətlə yetirilən elə bir insan yoxdur ki, onun (axıdılmış) qanına görə (qazanılmış günahdan) ilk Adəm oğluna[1] bir pay çatmış olmasın. Çünki adam öldürməyin əsasını o qoymuşdur." (əl-Buxari, 3335)

## ٢ – باب: قِصَّةُ يَأْجُوجَ وَمَأْجُوجَ وَقَوْلُ اللَّهِ تَعَالَى: ﴿قَالُوا۟ يَٰذَا ٱلْقَرْنَيْنِ إِنَّ يَأْجُوجَ وَمَأْجُوجَ مُفْسِدُونَ فِى ٱلْأَرْضِ﴾

## 2-ci fəsil. Yəcuc və Məcucun hekayəsi. Uca Allahın: "Onlar dedilər: "Ey Zülqərneyn![2] Yəcuc və Məcuc *tayfaları* yer üzündə fitnə-fəsad törədirlər..."[3] sözü

١٤٠١ – عَنْ زَيْنَبَ ابْنَةَ جَحْشٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ دَخَلَ عَلَيْهَا فَزِعًا يَقُولُ: «لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَيْلٌ لِلْعَرَبِ مِنْ شَرٍّ قَدِ اقْتَرَبَ فُتِحَ الْيَوْمَ مِنْ رَدْمِ يَأْجُوجَ وَمَأْجُوجَ مِثْلُ هَذِهِ». وَحَلَّقَ بِإِصْبَعِهِ الإِبْهَامِ وَالَّتِي تَلِيهَا. قَالَتْ زَيْنَبُ ابْنَةُ جَحْشٍ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ أَنَهْلِكُ وَفِينَا الصَّالِحُونَ قَالَ: «نَعَمْ، إِذَا كَثُرَ الْخُبْثُ». [رواه البخاري: ٣٣٤٦]

**1401.** Zeynəb bint Cəhş ﷺ rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ qəfil onun (otağına) daxil olub: "Allahdan başqa məbud yoxdur! Yaxınlaşmış şərdən dolayı vay ərəblərin halına! Bu gün Yəcuc və Məcuc səddindən bu boyda dəlik açıldı"– dedi və baş barmağı ilə şəhadət barmağını birləşdirərək (onları) halqa şəklinə saldı.

Zeynəb bint Cəhş dedi: "Mən soruşdum: "Ya Rəsulullah, aramızda əməlisaleh insanlar ola-ola biz həlakmı olacağıq?" Peyğəmbər ﷺ buyurdu: "Əgər günah işlər artarsa, bəli!" (əl-Buxari, 3346)

١٤٠٢ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «يَقُولُ اللَّهُ تَعَالَى يَا آدَمُ. فَيَقُولُ لَبَّيْكَ وَسَعْدَيْكَ وَالْخَيْرُ فِى يَدَيْكَ. فَيَقُولُ أَخْرِجْ بَعْثَ النَّارِ. قَالَ وَمَا بَعْثُ النَّارِ قَالَ مِنْ كُلِّ أَلْفٍ تِسْعَمِائَةٍ وَتِسْعَةً وَتِسْعِينَ، فَعِنْدَهُ يَشِيبُ الصَّغِيرُ، وَتَضَعُ كُلُّ ذَاتِ حَمْلٍ حَمْلَهَا، وَتَرَى النَّاسَ سُكَارَى، وَمَا هُمْ بِسُكَارَى، وَلَكِنَّ عَذَابَ اللَّهِ شَدِيدٌ». قَالُوا يَا رَسُولَ اللَّهِ وَأَيُّنَا ذَلِكَ الْوَاحِدُ قَالَ: «أَبْشِرُوا فَإِنَّ مِنْكُمْ رَجُلٌ، وَمِنْ يَأْجُوجَ وَمَأْجُوجَ أَلْفٌ». ثُمَّ قَالَ: «وَالَّذِى نَفْسِى بِيَدِهِ ، إِنِّى أَرْجُو أَنْ تَكُونُوا رُبُعَ أَهْلِ الْجَنَّةِ». فَكَبَّرْنَا. فَقَالَ: «أَرْجُو أَنْ تَكُونُوا ثُلُثَ أَهْلِ الْجَنَّةِ». فَكَبَّرْنَا. فَقَالَ: «أَرْجُو أَنْ تَكُونُوا نِصْفَ أَهْلِ الْجَنَّةِ». فَكَبَّرْنَا. فَقَالَ: «مَا أَنْتُمْ فِى النَّاسِ إِلاَّ كَالشَّعَرَةِ السَّوْدَاءِ فِى جِلْدِ ثَوْرٍ أَبْيَضَ، أَوْ كَشَعَرَةٍ بَيْضَاءَ فِى جِلْدِ ثَوْرٍ أَسْوَدَ». [رواه البخاري: ٣٣٤٨]

**1402.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü Uca Allah: "Ey Adəm!"– deyə buyuracaq. Adəm deyəcək: "Buyur, hüzurun-

---

[1] Bax: "əl-Maidə" surəsi, 27-32.

[2] Hakimiyyəti bütün yer üzünə yayılmış qədim dünyanın ən böyük hökmdarlarından biri. O mömin və təqvalı bir insan idi. Uca Allahın mərhəməti sayəsində bir müddət insanları Yəcuc-Məcuc qəbiləsinin əlindən xilas etmişdi. Allahın bu mömin bəndəsi əl-Kəhf surəsində xatırlanır. Bax: "əl-Kəhf" surəsi, 83-98.

[3] "əl-Kəhf" surəsi, 94.

dayam və əmrinə müntəzirəm. Xeyir yalnız Sənin Əlindədir!" Allah buyuracaq: "Cəhənnəmə vasil olacaq kimsələri ayır!" Adəm deyəcək: "Cəhənnəmə vasil olanların (sayı) nə qədərdir?" Allah buyuracaq: "Hər min nəfərdən doqquz yüz doxsan doqquzu (Cəhənnəmə gedəcək)." O zaman uşaqların saçları ağaracaq, hamilə qadın bətnindəkini salacaq, insanları sərxoş görəcəksən, halbuki onlar sərxoş olmayacaqlar. Ancaq Allahın əzabı çox şiddətlidir[1]. (Əshabələr) dedilər: "Ya Rəsulullah, hansımız o bir nəfərlərdən olacaq?" Peyğəmbər ﷺ buyurdu: "Sevinin! Heç şübhəsiz ki, bir nəfər sizdən, doqquz yüz doxsan doqquz nəfər isə Yəcuc və Məcuc tayfalarından olacaq." Sonra davam edib dedi: "Canım Əlində olan Allaha and olsun ki, mən sizin Cənnət əhlinin dörddə birini təşkil edəcəyinizə ümid edirəm." Biz: "Allahu Əkbər"- dedik. (Peyğəmbər ﷺ) dedi: "Mən sizin Cənnət əhlinin üçdə birini təşkil edəcəyinizə ümid edirəm." Biz (yenə): "Allahu Əkbər"- dedik. (Peyğəmbər ﷺ) dedi: "Mən sizin Cənnət əhlinin yarısını təşkil edəcəyinizə ümid edirəm." Biz (yenə): "Allahu Əkbər"– dedik. (Peyğəmbər ﷺ) dedi: "(O gün) siz (say etibarilə) insanlar arasında, ağ öküzün dərisindəki qara tük və ya qara öküzün dərisindəki ağ tük kimi olacaqsınız." (əl-Buxari, 3348)

## 3-cü fəsil. Uca Allahın: "Həqiqətən, İbrahim Allaha müti, hənif bir rəhbər idi..."[2] sözü

## ٣– باب: قَوْلُ اللَّهِ تَعَالَى:
﴿ إِنَّ إِبْرَاهِيمَ كَانَ أُمَّةً قَانِتًا لِّلَّهِ حَنِيفًا ﴾

١٤٠٣ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنَّكُمْ مَحْشُورُونَ حُفَاةً عُرَاةً غُرْلاً – ثُمَّ قَرَأَ: ﴿كَمَا بَدَأْنَا أَوَّلَ خَلْقٍ نُّعِيدُهُ وَعْدًا عَلَيْنَا إِنَّا كُنَّا فَاعِلِينَ﴾ وَأَوَّلُ مَنْ يُكْسَى يَوْمَ الْقِيَامَةِ إِبْرَاهِيمُ، وَإِنَّ أُنَاسًا مِنْ أَصْحَابِي يُؤْخَذُ بِهِمْ ذَاتَ الشِّمَالِ فَأَقُولُ أَصْحَابِي أَصْحَابِي. فَيَقُولُ: إِنَّهُمْ لَمْ يَزَالُوا مُرْتَدِّينَ عَلَى أَعْقَابِهِمْ مُنْذُ فَارَقْتَهُمْ. فَأَقُولُ كَمَا قَالَ الْعَبْدُ الصَّالِحُ: ﴿وَكُنتُ عَلَيْهِمْ شَهِيدًا مَّا دُمْتُ فِيهِمْ﴾ إِلَى قَوْلِهِ ﴿الْحَكِيمُ﴾. [رواه البخاري: ٣٣٤٩]

**1403.** İbn Abbas رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ: "(Qiyamət günü) siz ayaqyalın, lüt-üryan və sünnət olunmamış halda məhşərə toplanacaqsınız"- dedi, sonra da bu ayəni oxudu: "...*Məxluqatı* ilk dəfə yaratdığımız kimi yenə əvvəlki halına qaytaracağıq. Biz vəd vermişik. Sözsüz ki, Biz onu yerinə yetirəcəyik."[3] (Sonra dedi): "Əyninə paltar geyindirilən ilk şəxs İbrahim olacaq. (Həmin vaxt) əshabələrimdən bəzilərini sol tərəfə aparacaqlar. Mən (onların atəşə doğru aparıldığını görüb): "Əshabələrim,[4] əshabələrim!"– deyəcəyəm. (Mənə): "Sən onları qoyub getdiyin gündən sonra onlar mürtəd oldular"– deyiləcək. Onda mən əməlisaleh bir qulun dediyi kimi deyəcəyəm: "Mən onlara ancaq Sənin mənə əmr etdiyini: "Mənim də Rəbbim, sizin də Rəbbiniz olan Allaha ibadət edin!"– demişəm. Nə qədər ki, onların arasında idim, mən onlara şahid idim. Sən məni *onların arasından* götürdükdən sonra isə onlara nəzarət edən Özün oldun. Sən hər şeyə Şahidsən. Əgər onlara əzab versən, sözsüz

[1] "əl-Həcc" surəsi, 2.
[2] "ən-Nəhl" surəsi, 120.
[3] "əl-Ənbiya" 104.
[4] Burada Peyğəmbərin ﷺ vəfatından sonra dindən dönmüş müsəlmanlar nəzərdə tutulur.

ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən!"[1] (əl-Buxari, 3349)

١٤٠٤ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِىِّ ﷺ قَالَ: «يَلْقَى إِبْرَاهِيمُ أَبَاهُ آزَرَ يَوْمَ الْقِيَامَةِ، وَعَلَى وَجْهِ آزَرَ قَتَرَةٌ وَغَبَرَةٌ، فَيَقُولُ لَهُ إِبْرَاهِيمُ أَلَمْ أَقُلْ لَكَ لاَ تَعْصِنِى فَيَقُولُ أَبُوهُ فَالْيَوْمَ لاَ أَعْصِيكَ. فَيَقُولُ إِبْرَاهِيمُ يَا رَبِّ، إِنَّكَ وَعَدْتَنِى أَنْ لاَ تُخْزِيَنِى يَوْمَ يُبْعَثُونَ، فَأَىُّ خِزْىٍ أَخْزَى مِنْ أَبِى الأَبْعَدِ فَيَقُولُ اللَّهُ تَعَالَى إِنِّى حَرَّمْتُ الْجَنَّةَ عَلَى الْكَافِرِينَ، ثُمَّ يُقَالُ يَا إِبْرَاهِيمُ مَا تَحْتَ رِجْلَيْكَ فَيَنْظُرُ فَإِذَا هُوَ بِذِيخٍ مُلْتَطِخٍ، فَيُؤْخَذُ بِقَوَائِمِهِ فَيُلْقَى فِى النَّارِ». [رواه البخاري: ٣٣٥٠]

**1404.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü İbrahim sir-sifəti toz-torpağa bulaşmış və qaralmış atası Azərlə görüşəcək və İbrahim ona deyəcək. "Məgər mən sənə deməmişdim ki, mənə asi olma?" Atası deyəcək: "Bu gün mən sənə asi olmayacağam!" Onda İbrahim deyəcək: "Ey Rəbbim! Sən mənə, onların diriləcəyi gün məni rüsvay etməyəcəyinə söz vermişdin. (Sənin rəhmətindən) uzaq düşmüş atamdan daha böyük rüsvayçılıq ola bilərmi?!" Uca Allah buyuracaq: "Mən Cənnəti kafirlərə haram buyurmuşam." Sonra (ona) deyiləcək: "Ey İbrahim, ayağının altındakı nədir?" İbrahim (ayağının altına) baxdıqda qana bulanmış bir kaftar görəcək. Sonra bu kaftarı ayaqlarından tutub Oda atacaqlar." (əl-Buxari, 3350)

١٤٠٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قِيلَ يَا رَسُولَ اللَّهِ، مَنْ أَكْرَمُ النَّاسِ قَالَ: «أَتْقَاهُمْ». فَقَالُوا لَيْسَ عَنْ هَذَا نَسْأَلُكَ. قَالَ: «فَيُوسُفُ نَبِىُّ اللَّهِ ابْنُ نَبِىِّ اللَّهِ ابْنِ نَبِىِّ اللَّهِ ابْنِ خَلِيلِ اللَّهِ». قَالُوا لَيْسَ عَنْ هَذَا نَسْأَلُكَ. قَالَ: «فَعَنْ مَعَادِنِ الْعَرَبِ تَسْأَلُونَ خِيَارُهُمْ فِى الْجَاهِلِيَّةِ خِيَارُهُمْ فِى الإِسْلاَمِ إِذَا فَقُهُوا». [رواه البخاري: ٣٣٥٣]

**1405.** Əbu Hureyra ﷺ rəvayət etmişdir ki, (bir dəfə Peyğəmbərdən ﷺ) soruşdular: "İnsanların ən hörmətlisi kimdir?" O dedi: "Allahdan ən çox qorxanıdır." (Əshabələr) dedilər: "Biz səndən bu haqda soruşmuruq." O dedi: "Allahın sevimli dostu (İbrahimin) oğlu (İshaq) peyğəmbərin oğlu (Yaqub) peyğəmbərin oğlu Yusuf peyğəmbərdir." Onlar dedilər: "Biz səndən bu haqda soruşmuruq." O dedi: "Yəqin ki, siz məndən ərəblərin əcdadı barədə soruşursunuz? (Biləsiniz ki,) cahiliyyət dövründə xeyirli olanlarınız, – əgər şəriəti başa düşsələr, – İslamda da xeyirli olacaqlar." (əl-Buxari, 3353)

١٤٠٦ – عَنْ سَمُرَةَ بْنِ جُنْدَبٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَتَانِى اللَّيْلَةَ آتِيَانِ، فَأَتَيْنَا عَلَى رَجُلٍ طَوِيلٍ، لاَ أَكَادُ أَرَى رَأْسَهُ طُولاً، وَإِنَّهُ إِبْرَاهِيمُ ﷺ». [رواه البخاري: ٣٣٥٤]

**1406.** Səmura ibn Cundəb ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bu gecə (yuxuda) yanıma iki nəfər gəldi. Sonra biz hündürboylu bir adamın yanına gəldik. Adamın boyu çox uzun olduğundan mən onun başını əməlli görə bilmədim. Bu, İbrahim ﷺ idi." (əl-Buxari, 3354)

١٤٠٧ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَمَّا إِبْرَاهِيمُ فَانْظُرُوا إِلَى صَاحِبِكُمْ، وَأَمَّا مُوسَى فَجَعْدٌ آدَمُ عَلَى جَمَلٍ أَحْمَرَ مَخْطُومٍ بِخُلْبَةٍ، كَأَنِّى أَنْظُرُ إِلَيْهِ انْحَدَرَ فِى الْوَادِى». [رواه البخاري: ٣٣٥٥]

[1] "əl-Maidə" surəsi, 117-118.

**1407.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İbrahimə gəlincə, (əgər onu görmək istəyirsinizsə,) dostunuza[1] baxın. Musaya gəldikdə isə, o, qarabuğdayı, qıvrımsaç bir adam idi, özü də yedəyi xurma lifindən hörülmüş ipdən olan qırmızı dəvənin üstündə oturmuşdu və mən sanki onun vadiyə endiyini görürdüm.” (əl-Buxari, 3355)

**١٤٠٨** – (أ) – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «اخْتَتَنَ إِبْرَاهِيمُ ﷺ وَهُوَ ابْنُ ثَمَانِينَ سَنَةً بِالْقَدُّومِ». [رواه البخاري: ٣٣٥٦]

**1408.** (a) – Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İbrahim ﷺ səksən yaşında ikən Qəddum deyilən yerdə sünnət olunmuşdur.” (əl-Buxari, 3356)

**١٤٠٨** – (ب) – وَ فِي رِوَايَةٍ عَنْهُ: « بِالْقَدُومِ». [رواه البخاري: ٣٣٥٦]

**1408.** (b) – Digər rəvayətdə deyilir ki, “(İbrahim ﷺ səksən yaşında ikən) kərki ilə (sünnət edilmişdir).” (əl-Buxari, 3356)

**١٤٠٩** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: لَمْ يَكْذِبْ إِبْرَاهِيمُ ﷺ إِلاَّ ثَلاَثَ كَذَبَاتٍ ثِنْتَيْنِ مِنْهُنَّ فِي ذَاتِ اللَّهِ عَزَّ وَجَلَّ، قَوْلُهُ: ﴿إِنِّي سَقِيمٌ﴾ وَقَوْلُهُ: ﴿بَلْ فَعَلَهُۥ كَبِيرُهُمْ هَٰذَا﴾، وَقَالَ بَيْنَا هُوَ ذَاتَ يَوْمٍ وَسَارَةُ إِذْ أَتَى عَلَى جَبَّارٍ مِنَ الْجَبَابِرَةِ فَقِيلَ لَهُ إِنَّ هَا هُنَا رَجُلاً مَعَهُ امْرَأَةٌ مِنْ أَحْسَنِ النَّاسِ، فَأَرْسَلَ إِلَيْهِ، فَسَأَلَهُ عَنْهَا. فَقَالَ مَنْ هَذِهِ قَالَ أُخْتِي، فَأَتَى سَارَةَ قَالَ يَا سَارَةُ، لَيْسَ عَلَى وَجْهِ الأَرْضِ مُؤْمِنٌ غَيْرِي وَغَيْرُكِ، وَإِنَّ هَذَا سَأَلَنِي، فَأَخْبَرْتُهُ أَنَّكِ أُخْتِي فَلاَ تُكَذِّبِينِي. فَأَرْسَلَ إِلَيْهَا، فَلَمَّا دَخَلَتْ عَلَيْهِ ذَهَبَ يَتَنَاوَلُهَا بِيَدِهِ، فَأُخِذَ فَقَالَ ادْعِي اللَّهَ لِي وَلاَ أَضُرُّكِ. فَدَعَتِ اللَّهَ فَأُطْلِقَ ، ثُمَّ تَنَاوَلَهَا الثَّانِيَةَ، فَأُخِذَ مِثْلَهَا أَوْ أَشَدَّ فَقَالَ ادْعِي اللَّهَ لِي وَلاَ أَضُرُّكِ. فَدَعَتْ فَأُطْلِقَ. فَدَعَا بَعْضَ حَجَبَتِهِ فَقَالَ إِنَّكُمْ لَمْ تَأْتُونِي بِإِنْسَانٍ، إِنَّمَا أَتَيْتُمُونِي بِشَيْطَانٍ. فَأَخْدَمَهَا هَاجَرَ فَأَتَتْهُ، وَهُوَ قَائِمٌ يُصَلِّي، فَأَوْمَأَ بِيَدِهِ مَهْيَا قَالَتْ رَدَّ اللَّهُ كَيْدَ الْكَافِرِ – أَوِ الْفَاجِرِ – فِي نَحْرِهِ، وَأَخْدَمَ هَاجَرَ. قَالَ أَبُو هُرَيْرَةَ تِلْكَ أُمُّكُمْ يَا بَنِي مَاءِ السَّمَاءِ. [رواه البخاري: ٣٣٥٨]

**1409.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “İbrahim ﷺ yalnız üç dəfə yalan danışmışdır. Bunlardan ikisi qüdrətli və əzəmətli Allah üçün idi. (Birinci dəfə) o demişdir: “Mən xəstəyəm!”[2] (İkinci dəfə isə) demişdir: “Xeyr, bunu onların bu böyüyü etmiş olar” [3]. (Üçüncü hadisə isə belə olmuşdur): “Bir gün İbrahim (zövcəsi) Sara ilə qəddar padşahlardan birinin məmləkətinə gəldikdə (padşaha) xəbər verdilər ki, şəhərə bir nəfər gəlib, yanında da çox gözəl bir qadın var.” Padşah (qadının kim olduğunu öyrənmək üçün) onun yanına adam göndərdi. O adam gəlib İbrahimdən: “Bu kimdir?”- deyə soruşdu. İbrahim: “Mənim bacımdır!”– deyə cavab verdi. Sonra da Saranın yanına gəlib dedi: “Ey Sara! Yer üzündə bizim ikimizdən başqa mömin olan bir kimsə yoxdur. Bu (padşah) məndən (sənin barəndə) soruşdu. Mən də ona xəbər verdim ki, sən mənim bacımsan. Odur ki, mənim dediyimi təkzib etmə.” Çox keçmədən padşah Saranın dalınca adam göndərdi. Sara padşahın yanına gəldikdə, o, qadına yaxınlaşıb ona toxunmaq istədi, lakin qıc

---

[1] Burada Peyğəmbər ﷺ özünü qəsd edir.
[2] “əs-Saffat” surəsi, 89.
[3] “əl-Ənbiya” surəsi, 63.

olub qaldı. Onda o yalvarıb dedi: "Mənim üçün Allaha dua etsən, sənə pislik etmərəm!" Sara Allaha dua etdi və onun əlləri açıldı. Padşah ikinci dəfə ona toxunmaq istədikdə onun halı əvvəlkindən betər oldu. O yenə yalvarıb dedi: "Mənim üçün Allaha dua etsən, sənə pislik etmərəm!" Sara Allaha dua etdi və onun əlləri açıldı. Padşah gözətçilərdən bəzisini çağırıb dedi: "Siz mənim yanıma insan yox, şeytan gətirmisiniz!" Bundan sonra Padşah (Saranı buraxdı, üstəlik) ona xidmətçi Həcəri də bağışladı. Sara İbrahimin yanına gəldikdə, o, namaz qılırdı. Buna görə də əli ilə işarə etdi ki: "Nə oldu?" Sara dedi: "Allah kafirin, yaxud günahkarın hiyləsini onun öz başında çatlatdı, mənə də xidmətçi olaraq Həcəri bəxş etdi!"

Əbu Hureyra dedi: "O[1] sizin ananızdır, ey səmavi suyun[2] oğulları!" (əl-Buxari, 3358)

١٤١٠ – عَنْ أُمِّ شَرِيكٍ رضي الله عنها أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَمَرَ بِقَتْلِ الْوَزَغِ وَقَالَ: «كَانَ يَنْفُخُ عَلَى إِبْرَاهِيمَ عليه السلام». [رواه البخاري: ٣٣٥٩]

**1410.** Ummu Şərik رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ kərtənkələ öldürməyi əmr etmiş və demişdir: "O, İbrahimin عليه السلام atıldığı oda üfürürdü[3]". (əl-Buxari, 3359)

١٤١١ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: أَوَّلَ مَا اتَّخَذَ النِّسَاءُ الْمِنْطَقَ مِنْ قِبَلِ أُمِّ إِسْمَاعِيلَ، اتَّخَذَتْ مِنْطَقًا لَتُعَفِّيَ أَثَرَهَا عَلَى سَارَةَ، ثُمَّ جَاءَ بِهَا إِبْرَاهِيمُ، وَبِابْنِهَا إِسْمَاعِيلَ وَهِيَ تُرْضِعُهُ حَتَّى وَضَعَهُمَا عِنْدَ الْبَيْتِ عِنْدَ دَوْحَةٍ، فَوْقَ زَمْزَمَ فِي أَعْلَى الْمَسْجِدِ، وَلَيْسَ بِمَكَّةَ يَوْمَئِذٍ أَحَدٌ، وَلَيْسَ بِهَا مَاءٌ، فَوَضَعَهُمَا هُنَالِكَ، وَ وَضَعَ عِنْدَهُمَا جِرَابًا فِيهِ تَمْرٌ وَسِقَاءً فِيهِ مَاءٌ، ثُمَّ قَفَّى إِبْرَاهِيمُ مُنْطَلِقًا فَتَبِعَتْهُ أُمُّ إِسْمَاعِيلَ فَقَالَتْ يَا إِبْرَاهِيمُ أَيْنَ تَذْهَبُ وَتَتْرُكُنَا بِهَذَا الْوَادِي الَّذِي لَيْسَ فِيهِ إِنْسٌ وَلاَ شَيْءٌ فَقَالَتْ لَهُ ذَلِكَ مِرَارًا، وَجَعَلَ لاَ يَلْتَفِتُ إِلَيْهَا فَقَالَتْ لَهُ آللَّهُ الَّذِي أَمَرَكَ بِهَذَا قَالَ نَعَمْ. قَالَتْ إِذًا لاَ يُضَيِّعُنَا. ثُمَّ رَجَعَتْ، فَانْطَلَقَ إِبْرَاهِيمُ حَتَّى إِذَا كَانَ عِنْدَ الثَّنِيَّةِ حَيْثُ لاَ يَرَوْنَهُ اسْتَقْبَلَ بِوَجْهِهِ الْبَيْتَ، ثُمَّ دَعَا بِهَؤُلاَءِ الْكَلِمَاتِ وَرَفَعَ يَدَيْهِ، فَقَالَ: ﴿رَّبَّنَآ إِنِّيٓ أَسۡكَنتُ مِن ذُرِّيَّتِي بِوَادٍ غَيۡرِ ذِي زَرۡعٍ﴾ حَتَّى بَلَغَ: ﴿يَشۡكُرُونَ﴾. وَجَعَلَتْ أُمُّ إِسْمَاعِيلَ تُرْضِعُ إِسْمَاعِيلَ، وَتَشْرَبُ مِنْ ذَلِكَ الْمَاءِ، حَتَّى إِذَا نَفِدَ مَا فِي السِّقَاءِ عَطِشَتْ وَعَطِشَ ابْنُهَا، وَجَعَلَتْ تَنْظُرُ إِلَيْهِ يَتَلَوَّى – أَوْ قَالَ يَتَلَبَّطُ – فَانْطَلَقَتْ كَرَاهِيَةَ أَنْ تَنْظُرَ إِلَيْهِ، فَوَجَدَتِ الصَّفَا أَقْرَبَ جَبَلٍ فِي الأَرْضِ يَلِيهَا، فَقَامَتْ عَلَيْهِ ثُمَّ اسْتَقْبَلَتِ الْوَادِيَ تَنْظُرُ هَلْ تَرَى أَحَدًا فَلَمْ تَرَ أَحَدًا، فَهَبَطَتْ مِنَ الصَّفَا حَتَّى إِذَا بَلَغَتِ الْوَادِيَ رَفَعَتْ طَرَفَ دِرْعِهَا، ثُمَّ سَعَتْ سَعْيَ الإِنْسَانِ الْمَجْهُودِ، حَتَّى جَاوَزَتِ الْوَادِيَ، ثُمَّ أَتَتِ الْمَرْوَةَ، فَقَامَتْ عَلَيْهَا وَنَظَرَتْ هَلْ تَرَى أَحَدًا، فَلَمْ تَرَ أَحَدًا، فَفَعَلَتْ ذَلِكَ سَبْعَ مَرَّاتٍ. قَالَ النَّبِيُّ ﷺ: «فَذَلِكَ سَعْيُ النَّاسِ بَيْنَهُمَا». – فَلَمَّا أَشْرَفَتْ عَلَى الْمَرْوَةِ سَمِعَتْ صَوْتًا، فَقَالَتْ صَهٍ. تُرِيدُ نَفْسَهَا، ثُمَّ تَسَمَّعَتْ، فَسَمِعَتْ أَيْضًا، فَقَالَتْ قَدْ أَسْمَعْتَ، إِنْ كَانَ عِنْدَكَ غِوَاثٌ. فَإِذَا هِيَ بِالْمَلَكِ، عِنْدَ مَوْضِعِ زَمْزَمَ، فَبَحَثَ بِعَقِبِهِ – أَوْ قَالَ بِجَنَاحِهِ – حَتَّى ظَهَرَ الْمَاءُ، فَجَعَلَتْ تُحَوِّضُهُ وَتَقُولُ بِيَدِهَا هَكَذَا، وَجَعَلَتْ تَغْرِفُ مِنَ الْمَاءِ فِي سِقَائِهَا، وَهُوَ يَفُورُ بَعْدَ مَا تَغْرِفُ. قَالَ النَّبِيُّ ﷺ: «يَرْحَمُ اللَّهُ أُمَّ إِسْمَاعِيلَ لَوْ تَرَكَتْ زَمْزَمَ – أَوْ قَالَ لَوْ لَمْ تَغْرِفْ مِنَ الْمَاءِ – لَكَانَتْ زَمْزَمُ عَيْنًا مَعِينًا».

---

[1] Əbu Hureyra رضي الله عنه Həcəri qəsd etmişdir.

[2] Çox güman ki, Əbu Hureyra رضي الله عنه bu sözlə qoyunlarını səhralardakı yağış suyu ilə suvaran ərəbləri qəsd etmişdir. Bəzi şərhçilər isə "səmavi suyun" Zəm-zəm olduğunu söyləmişlər. (Fəthul-Bari, 10/141)

[3] Müşriklər İbrahimi عليه السلام oda atdıqdan sonra heyvanlar odu söndürməyə çalışmış, kərtənkələ isə əksinə, oda üfürüb onu alovlandırırmış.

– قَالَ فَشَرِبَتْ وَأَرْضَعَتْ وَلَدَهَا، فَقَالَ لَهَا الْمَلَكُ لاَ تَخَافُوا الضَّيْعَةَ، فَإِنَّ هَا هُنَا بَيْتَ اللَّهِ ، يَبْنِى هَذَا الْغُلاَمُ، وَأَبُوهُ، وَإِنَّ اللَّهَ لاَ يُضِيعُ أَهْلَهُ. وَكَانَ الْبَيْتُ مُرْتَفِعًا مِنَ الأَرْضِ كَالرَّابِيَةِ، تَأْتِيهِ السُّيُولُ فَتَأْخُذُ عَنْ يَمِينِهِ وَشِمَالِهِ، فَكَانَتْ كَذَلِكَ، حَتَّى مَرَّتْ بِهِمْ رُفْقَةٌ مِنْ جُرْهُمَ – أَوْ أَهْلُ بَيْتٍ مِنْ جُرْهُمَ – مُقْبِلِينَ مِنْ طَرِيقِ كَدَاءٍ فَنَزَلُوا فِى أَسْفَلِ مَكَّةَ، فَرَأَوْا طَائِرًا عَائِفًا. فَقَالُوا إِنَّ هَذَا الطَّائِرَ لَيَدُورُ عَلَى مَاءٍ، لَعَهْدُنَا بِهَذَا الْوَادِى وَمَا فِيهِ مَاءٌ، فَأَرْسَلُوا جَرِيًّا أَوْ جَرِيَّيْنِ، فَإِذَا هُمْ بِالْمَاءِ، فَرَجَعُوا فَأَخْبَرُوهُمْ بِالْمَاءِ، فَأَقْبَلُوا، قَالَ وَأُمُّ إِسْمَاعِيلَ عِنْدَ الْمَاءِ فَقَالُوا أَتَأْذَنِينَ لَنَا أَنْ نَنْزِلَ عِنْدَكِ فَقَالَتْ نَعَمْ، وَلَكِنْ لاَ حَقَّ لَكُمْ فِى الْمَاءِ. قَالُوا نَعَمْ. قَالَ النَّبِىُّ ﷺ: «فَأَلْفَى ذَلِكَ أُمَّ إِسْمَاعِيلَ، وَهِىَ تُحِبُّ الإِنْسَ» فَنَزَلُوا وَأَرْسَلُوا إِلَى أَهْلِيهِمْ، فَنَزَلُوا مَعَهُمْ حَتَّى إِذَا كَانَ بِهَا أَهْلُ أَبْيَاتٍ مِنْهُمْ، وَشَبَّ الْغُلاَمُ، وَتَعَلَّمَ الْعَرَبِيَّةَ مِنْهُمْ، وَأَنْفَسَهُمْ وَأَعْجَبَهُمْ حِينَ شَبَّ، فَلَمَّا أَدْرَكَ زَوَّجُوهُ امْرَأَةً مِنْهُمْ، وَمَاتَتْ أُمُّ إِسْمَاعِيلَ، فَجَاءَ إِبْرَاهِيمُ، بَعْدَ مَا تَزَوَّجَ إِسْمَاعِيلُ يُطَالِعُ تَرِكَتَهُ، فَلَمْ يَجِدْ إِسْمَاعِيلَ، فَسَأَلَ امْرَأَتَهُ عَنْهُ فَقَالَتْ خَرَجَ يَبْتَغِى لَنَا. ثُمَّ سَأَلَهَا عَنْ عَيْشِهِمْ وَهَيْئَتِهِمْ فَقَالَتْ نَحْنُ بِشَرٍّ، نَحْنُ فِى ضِيقٍ وَشِدَّةٍ. فَشَكَتْ إِلَيْهِ. قَالَ فَإِذَا جَاءَ زَوْجُكِ فَاقْرَئِى عَلَيْهِ السَّلاَمَ، وَقُولِى لَهُ يُغَيِّرْ عَتَبَةَ بَابِهِ. فَلَمَّا جَاءَ إِسْمَاعِيلُ، كَأَنَّهُ آنَسَ شَيْئًا، فَقَالَ هَلْ جَاءَكُمْ مِنْ أَحَدٍ قَالَتْ نَعَمْ، جَاءَنَا شَيْخٌ كَذَا وَكَذَا، فَسَأَلَنَا عَنْكَ فَأَخْبَرْتُهُ، وَسَأَلَنِى كَيْفَ عَيْشُنَا فَأَخْبَرْتُهُ أَنَّا فِى جَهْدٍ وَشِدَّةٍ. قَالَ فَهَلْ أَوْصَاكِ بِشَىْءٍ قَالَتْ نَعَمْ، أَمَرَنِى أَنْ أَقْرَأَ عَلَيْكَ السَّلاَمَ، وَيَقُولُ غَيِّرْ عَتَبَةَ بَابِكَ. قَالَ ذَاكِ أَبِى وَقَدْ أَمَرَنِى أَنْ أُفَارِقَكِ الْحَقِى بِأَهْلِكِ. فَطَلَّقَهَا، وَتَزَوَّجَ مِنْهُمْ أُخْرَى، فَلَبِثَ عَنْهُمْ إِبْرَاهِيمُ مَا شَاءَ اللَّهُ ثُمَّ أَتَاهُمْ بَعْدُ، فَلَمْ يَجِدْهُ، فَدَخَلَ عَلَى امْرَأَتِهِ، فَسَأَلَهَا عَنْهُ. فَقَالَتْ خَرَجَ يَبْتَغِى لَنَا. قَالَ كَيْفَ أَنْتُمْ وَسَأَلَهَا عَنْ عَيْشِهِمْ، وَهَيْئَتِهِمْ. فَقَالَتْ نَحْنُ بِخَيْرٍ وَسَعَةٍ. وَأَثْنَتْ عَلَى اللَّهِ. فَقَالَ مَا طَعَامُكُمْ قَالَتِ اللَّحْمُ. قَالَ فَمَا شَرَابُكُمْ قَالَتِ الْمَاءُ. فَقَالَ اللَّهُمَّ بَارِكْ لَهُمْ فِى اللَّحْمِ وَالْمَاءِ. قَالَ النَّبِىُّ ﷺ: «وَلَمْ يَكُنْ لَهُمْ يَوْمَئِذٍ حَبٌّ، وَلَوْ كَانَ لَهُمْ دَعَا لَهُمْ فِيهِ». قَالَ فَهُمَا لاَ يَخْلُو عَلَيْهِمَا أَحَدٌ بِغَيْرِ مَكَّةَ إِلاَّ لَمْ يُوَافِقَاهُ . قَالَ فَإِذَا جَاءَ زَوْجُكِ فَاقْرَئِى عَلَيْهِ السَّلاَمَ ، وَمُرِيهِ يُثْبِتُ عَتَبَةَ بَابِهِ، فَلَمَّا جَاءَ إِسْمَاعِيلُ قَالَ هَلْ أَتَاكُمْ مِنْ أَحَدٍ قَالَتْ نَعَمْ أَتَانَا شَيْخٌ حَسَنُ الْهَيْئَةِ، وَأَثْنَتْ عَلَيْهِ ، فَسَأَلَنِى عَنْكَ فَأَخْبَرْتُهُ، فَسَأَلَنِى كَيْفَ عَيْشُنَا فَأَخْبَرْتُهُ أَنَّا بِخَيْرٍ. قَالَ فَأَوْصَاكِ بِشَىْءٍ قَالَتْ نَعَمْ، هُوَ يَقْرَأُ عَلَيْكَ السَّلاَمَ، وَيَأْمُرُكَ أَنْ تُثْبِتَ عَتَبَةَ بَابِكَ. قَالَ ذَاكِ أَبِى، وَأَنْتِ الْعَتَبَةُ، أَمَرَنِى أَنْ أُمْسِكَكِ. ثُمَّ لَبِثَ عَنْهُمْ مَا شَاءَ اللَّهُ، ثُمَّ جَاءَ بَعْدَ ذَلِكَ، وَإِسْمَاعِيلُ يَبْرِى نَبْلاً لَهُ تَحْتَ دَوْحَةٍ قَرِيبًا مِنْ زَمْزَمَ، فَلَمَّا رَآهُ قَامَ إِلَيْهِ، فَصَنَعَا كَمَا يَصْنَعُ الْوَالِدُ بِالْوَلَدِ وَالْوَلَدُ بِالْوَالِدِ، ثُمَّ قَالَ يَا إِسْمَاعِيلُ، إِنَّ اللَّهَ أَمَرَنِى بِأَمْرٍ. قَالَ فَاصْنَعْ مَا أَمَرَكَ رَبُّكَ. قَالَ وَتُعِينُنِى قَالَ وَأُعِينُكَ. قَالَ فَإِنَّ اللَّهَ أَمَرَنِى أَنْ أَبْنِىَ هَا هُنَا بَيْتًا. وَأَشَارَ إِلَى أَكَمَةٍ مُرْتَفِعَةٍ عَلَى مَا حَوْلَهَا. قَالَ فَعِنْدَ ذَلِكَ رَفَعَا الْقَوَاعِدَ مِنَ الْبَيْتِ، فَجَعَلَ إِسْمَاعِيلُ يَأْتِى بِالْحِجَارَةِ، وَإِبْرَاهِيمُ يَبْنِى، حَتَّى إِذَا ارْتَفَعَ الْبِنَاءُ جَاءَ بِهَذَا الْحَجَرِ فَوَضَعَهُ لَهُ، فَقَامَ عَلَيْهِ وَهُوَ يَبْنِى، وَإِسْمَاعِيلُ يُنَاوِلُهُ الْحِجَارَةَ، وَهُمَا يَقُولاَنِ: ﴿رَبَّنَا تَقَبَّلْ مِنَّآ إِنَّكَ أَنتَ ٱلسَّمِيعُ ٱلْعَلِيمُ﴾. [رواه البخاري: ٣٣٦٤]

**1411.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "Qadınlar arasında ilk qurşaq bağlayan İsmailin anası (Həcər) olmuşdur. O Saradan (gizlənib) öz izini itirmək üçün belə etmişdir.[1] Bundan sonra İbrahim həyat yoldaşı Həcəri südəmər oğlu İsmail ilə birlikdə (müqəddəs) Evin olduğu yerə – Zəm-zəmin

[1] Sara Həcəri İbrahimə bağışlamış və Həcər İsmailə hamilə qalmışdır. O, azad olduqda isə Sara onu İbrahimə qısqanmış və and içmişdir ki, Həcəri tutsa, onun üç əzasını kəsəcəkdir. Həcər bundan xəbər tutduqda belinə qurşaq bağlamış və izini itirmək üçün qurşağının ucunu yerlə sürüyərək qaçıb Saradan gizlənmişdir. (Fəthul-Bari, 10/146)

başına, məscidin yuxarı tərəfində bitmiş yekə bir ağacın yanına gətirdi. O dövrdə Məkkədə nə bir adam, nə də ki su var idi. İbrahim onları orada tərk edib, yanlarında da bir az xurma və su qoyub getdikdə, İsmailin anası onun dalınca qaçıb dedi: "Ey İbrahim, sən bizi ins-cins olmayan bu çöllükdə atıb gedirsən?!" Həcər bunu bir neçə dəfə təkrar etdi, lakin İbrahim ona tərəf dönüb baxmadı. Axırda qadın soruşdu: "Olmaya, bunu sənə Allah əmr edib?" İbrahim: "Bəli!"– deyə cavab verdi. Qadın: "Elə isə Allah bizi nəzarətsiz qoymaz"- deyib geri qayıtdı. İbrahim isə yoluna davam etdi və nəhayət onlardan tamamilə uzaqlaşıb gəlib dağ keçidinə çatdıqda üzünü (müqəddəs) Evə tərəf çevirdi və əllərini (göyə) qaldırıb belə dua etdi: "Ey Rəbbimiz! Mən nəslimdən bəzisini Sənin mühafizə olunan Evinin yaxınlığında, heç bir bitki olmayan bir vadidə sakin etdim. Ey Rəbbimiz! Onlar namaz qılsınlar deyə *belə etdim*. İnsanların bir qisminin qəlbini onlara meylli et və onlara *növbənöv* məhsullardan ruzi ver ki, bəlkə şükür etsinlər."[1] Həcər isə İsmailə süd verir, özü də (yanındakı) sudan içirdi. Tuluqdakı su qurtardıqdan sonra onun həm özü, həm oğlu bərk susadı. Həcər uşağın çabaladığını gördükdə dözməyib yaxınlıqda yerləşən Səfa dağına tərəf getdi. Dağın üstünə çıxıb ətrafa baxmağa başladı, lakin heç kəsi görə bilmədi. Qadın Səfa dağından aşağı endi və paltarının ətəyini qaldırıb tez-tez yeriyərək Mərva dağına tərəf getdi. Həcər vadini keçib Mərva dağına çatdıqda onun üstünə çıxıb ətrafa baxdı, lakin yenə də heç kəsi görə bilmədi. O, yeddi dəfə beləcə dağların arasında o tərəf-bu tərəfə getdi."

Peyğəmbər ﷺ demişdir: "Elə buna görə də müsəlmanlar (ziyarət əsnasında) bu dağlar arasında gedib-gəlirlər."

(İbn Abbas rəvayətinə davam edib dedi:) "Qadın Mərva dağına gəlib çatdıqda səs eşitdi və öz-özünə: "Sakit ol!"- dedi. Yenə səs eşitdikdə: "Səsini mənə eşitdirdin, mənə kömək edə bilərsənmi?"- dedi. Elə bu vaxt Zəm-zəmin yerində mələk gördü. Mələk qanadı ilə yerə vurdu və yerdən su qaynayıb çıxdı. Qadın əli ilə suyun qabağını aldı və tuluğa su doldurmağa başladı. Su isə axmağa davam edirdi."

Peyğəmbər ﷺ demişdir: "Allah İsmailin anasına rəhmət eləsin! Əgər o, Zəm-zəmə toxunmasaydı, o müəyyən bir bulağa çevriləcəkdi."

(İbn Abbas rəvayətinə davam edib dedi:) "Həcər sudan içdikdən sonra uşağını əmizdirdi. Mələk ona dedi: "Başlı-başına buraxılacağınızdan qorxmayın! Çünki Allahın Evi burada (olacaq). Onu bu uşaq və onun atası tikəcək. Allah onun ailəsini əsla nəzarətsiz buraxmaz." O dövrdə Kəbənin yalnız bünövrəsi var idi və çaylar onun həndəvərindən axıb gedirdi. Onlar bir müddət orada qaldılar. Nəhayət, Kəda tərəfdən gəlmiş Curhum qəbiləsindən olan bir dəstə adam Məkkənin aşağı tərəfində dayanmalı oldular. Onlar göydə uçan quşları görüb: "Bu quşlar ancaq su olan yerdə uçarlar. Axı o vadidə su olmamalıdır!"- dedilər, sonra da ora bir və ya iki nəfər göndərdilər. Göndərilən adamlar suyu görəndən sonra qayıdıb onlara xəbər verdilər və onların hamısı yığışıb oraya getdilər. O vaxt İsmailin anası suyun kənarında oturmuşdu. Onlar (ona yaxınlaşıb) dedilər: "Bizə sənin yanında qalmağa izn verirsənmi?" Həcər dedi: "Bəli, ancaq mənim iznim olmadan bu sudan istifadə etməyəcəksiniz." Onlar: "Razıyıq"- dedilər.

[1] "İbrahim" surəsi, 37.

Peyğəmbər ﷺ demişdir: "Bu təklif İsmailın anasının könlünə yatdı. Çünki o, insanlarla ünsiyyətdə olmağı sevirdi."

(İbn Abbas rəvayətinə davam edib dedi:) "Beləliklə, onlar orada məskunlaşdılar, sonra yaxınlarına xəbər göndərib onları öz yanlarına çağırdılar və onlar da orada məskən saldılar. Nəhayət uşaq[1] böyüyüb boya-başa çatdı və onlardan ərəb dilini öyrəndi. Onlar bu uşaqla fəxr edirdilər və onun fərasətinə heyran qalmışdılar. O yetkinlik yaşına yetişdikdə onu öz qızlarından biri ilə evləndirdilər. İsmailin anası vəfat etdikdən bir müddət sonra atası İbrahim ona baş çəkməyə gəldi, lakin onu evdə tapmadı. İbrahim İsmailin zövcəsindən onu xəbər aldıqda qadın dedi: "Gedib, bizim üçün yeməyə bir şey gətirsin." Sonra İbrahim qadından onların yaşayış tərzi və dolanışıqları barədə soruşdu. Qadın: "Vəziyyətimiz çox pisdir! Biz ehtiyac və yoxsulluq içində yaşayırıq"- deyə şikayət etməyə başladı. İbrahim buyurdu: "Ərin evə gəldikdə mənim salamımı ona çatdır və de ki, evinin astanasını dəyişdirsin." İsmail qayıtdıqda evə adam gəldiyini hiss edib yoldaşından: "Evimizə gələn olubmu?"- deyə soruşdu. Qadın dedi: "Bəli, filan əlamətləri olan qoca bir kişi gəlmişdi. O sənin barəndə soruşdu, mən də ona (evdə olmadığını) xəbər verdim. Sonra o, dolanışığımız barədə soruşdu, mən də ona bizim ehtiyac və yoxsulluq içində yaşadığımızı söylədim." İsmail dedi: "O sənə bir şey tövsiyə etdimi?" Qadın dedi: "Bəli, o, mənə buyurdu ki, onun salamını sənə çatdırım, həm də deyim ki, evinin astanasını dəyişəsən." İsmail dedi: "O gələn mənim atam idi. Mənə səndən ayrılmağı tövsiyə etdi. Odur ki, qayıt atan evinə." İsmail onu boşadıqdan sonra başqa bir qızla evləndi. Bir müddət keçdikdən sonra İbrahim yenə oğluna baş çəkməyə gəldi, lakin onu evdə tapmadı. İbrahim evə daxil oldu və İsmailin zövcəsindən onu xəbər aldıqda qadın dedi: "Gedib, bizim üçün yeməyə bir şey gətirsin." Sonra o, qadından onların yaşayış tərzi və dolanışıqları barədə soruşdu. Qadın: "Vəziyyətimiz çox yaxşıdır, hər şeyimiz var!"- deyib Allaha şükr etdi. İbrahim: "Nə yeyirsiniz?"- deyə soruşdu. Qadın: "Ət (yeyirik)"- deyə cavab verdi. İbrahim: "Nə içirsiniz?"- deyə soruşdu. Qadın: "Su (içirik)"- deyə cavab verdi. İbrahim dua edib dedi: "Allahım, bunların yediyi ətə və içdiyi suya bərəkət ver!"

Peyğəmbər ﷺ demişdir: "O vaxt onlarda buğda yox idi. Əgər yedikləri buğda olsaydı, İbrahim bunun üçün də Allahdan xeyir-bərəkət diləyərdi."

(İbn Abbas dedi:) "Kim Məkkənin xaricində yalnız ət və su ilə qidalanarsa, bunun ona zərəri dəyər." (Sonra o, rəvayətinə davam edib) dedi: "İbrahim buyurdu: "Ərin evə gəldikdə mənim salamımı ona çatdır və de ki, evinin astanasını qorusun." İsmail evə qayıtdıqda zövcəsindən: "Bizə gələn olubmu?"– deyə soruşdu. Qadın dedi: "Bəli, üzündən xeyirxahlıq yağan ixtiyar bir qoca gəlmişdi." Qadın onu tərifədikdən sonra dedi: "O məndən səni soruşdu, mən də ona sənin haqqında xəbər verdim. Sonra o, dolanışığımız barədə soruşdu, mən də ona vəziyyətimizin çox yaxşı olduğunu söylədim." İsmail soruşdu: "O sənə bir şey tövsiyə etdimi?" Qadın dedi: "Bəli, o, mənə buyurdu ki, onun salamını sənə çatdırım, həm də deyim ki, evinin astanasını qoruyasan." İsmail dedi: "O gələn mənim atam idi. Evimizin astanası isə sənsən. O mənə səndən möhkəm yapışmağı tövsiyə etdi." Allah istədiyi qədər İbrahim onlardan ayrı yaşadıqdan sonra yenə onlara baş çəkməyə gəldi.

[1] Yəni İsmail عليه السلام.

Həmin vaxt İsmail Zəm-zəmin yanında bitmiş böyük bir ağacın altında oturub oxlarının ucunu itiləyirdi. Atasını görcək ayağa qalxıb ona yaxınlaşdı və ata ilə oğul bir-birini bərk-bərk qucaqlayıb görüşdülər. Sonra İbrahim dedi: "Ey İsmail! Allah mənə (vacib) bir işi yerinə yetirməyi buyurub." İsmail dedi: "Rəbbinin sənə buyurduğunu yerinə yetir." İbrahim soruşdu: "Mənə kömək edərsənmi?" İsmail: "Sənə kömək edərəm"- dedi. İbrahim: "Allah mənə burada bir ev tikməyi əmr etdi"- deyib ətrafındakı hündür təpəni[1] ona göstərdi. Beləliklə də, onlar (müqəddəs) Evin bünövrəsini qaldırmağa başladılar. İsmail daş daşıyır, İbrahim də (onu) bina edirdi. Evin divarları ucaldıqdan sonra İsmail bu daşı gətirib yerə qoydu İbrahim də onun üstünə çıxıb tikintini davam etməyə başladı. (Yenə) İsmail daş gətirir, İbrahim də (onu) tikirdi. Onlar (işlərini görə-görə) deyirdilər: "Ey Rəbbimiz! *Bunu* bizdən qəbul et! Həqiqətən, Sən Eşidənsən, Bilənsən!"[2] (əl-Buxari, 3364)

١٤١٢ – عَنْ أَبِي ذَرٍّ ﵁ قَالَ: قُلْتُ يَا رَسُولَ اللَّهِ، أَيُّ مَسْجِدٍ وُضِعَ فِي الأَرْضِ أَوَّلُ؟ قَالَ: «الْمَسْجِدُ الْحَرَامُ». قَالَ قُلْتُ ثُمَّ أَيٌّ؟ قَالَ: «الْمَسْجِدُ الأَقْصَى». قُلْتُ كَمْ كَانَ بَيْنَهُمَا؟ قَالَ: «أَرْبَعُونَ سَنَةً، ثُمَّ أَيْنَمَا أَدْرَكَتْكَ الصَّلاَةُ بَعْدُ فَصَلِّهْ، فَإِنَّ الْفَضْلَ فِيهِ». [رواه البخاري: ٣٣٦٦]

**1412.** Rəvayət edilir ki, Əbu Zərr ﵁ demişdir: "(Bir dəfə Peyğəmbərdən ﷺ) soruşdum: "Ya Rəsulullah, yer üzündə ilk tikilmiş məscid hansıdır?" (Peyğəmbər ﷺ): "Məscidülhəramdır[3]"– dedi. Mən soruşdum: "Sonra hansıdır?" (Peyğəmbər ﷺ): "Məscidüləqsadır[4]"- dedi. Mən soruşdum: "Birincisi (tikildikdən sonra) ikincisi (tikilənədək) neçə il keçmişdi?" Peyğəmbər ﷺ: "Qırx il"– deyə cavab verdi, (sonra əlavə edib dedi): "Harada namaz vaxtına yetişsən, (oradaca) namazını qıl! Həqiqətən, bunda[5] xeyir-bərəkət vardır." (əl-Buxari, 3366)

١٤١٣ – عَنْ أَبِي حُمَيْدٍ السَّاعِدِيِّ ﵁ أَنَّهُمْ قَالُوا: يَا رَسُولَ اللَّهِ كَيْفَ نُصَلِّي عَلَيْكَ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «قُولُوا اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَأَزْوَاجِهِ وَذُرِّيَّتِهِ، كَمَا صَلَّيْتَ عَلَى آلِ إِبْرَاهِيمَ، وَبَارِكْ عَلَى مُحَمَّدٍ وَأَزْوَاجِهِ وَذُرِّيَّتِهِ، كَمَا بَارَكْتَ عَلَى آلِ إِبْرَاهِيمَ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ». [رواه البخاري: ٣٣٦٩]

**1413.** Əbu Humeyd əs-Saidi ﵁ rəvayət edir ki, (bir dəfə) əshabələr soruşdular: "Ya Rəsulullah, salavatı sənə necə gətirməliyik?" Peyğəmbər ﷺ buyurdu: "Deyin: "Allahummə salli alə Muhəmmədin və əzvacihi və zurriyyətihi, kəmə salleytə alə ali İbrahim, və barik alə Muhəmmədin və əzvacihi və zurriyyətihi, kəmə barəktə alə ali İbrahim. İnnəkə həmidun məcid.[6]" (əl-Buxari, 3369)

١٤١٤ – عَنِ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ: كَانَ النَّبِيُّ ﷺ يُعَوِّذُ الْحَسَنَ وَالْحُسَيْنَ وَيَقُولُ: «إِنَّ أَبَاكُمَا كَانَ يُعَوِّذُ بِهَا إِسْمَاعِيلَ وَإِسْحَاقَ، أَعُوذُ بِكَلِمَاتِ اللَّهِ التَّامَّةِ مِنْ كُلِّ شَيْطَانٍ وَهَامَّةٍ، وَمِنْ كُلِّ عَيْنٍ لاَمَّةٍ». [رواه البخاري: ٣٣٧١]

---

[1] Yəni Kəbənin bünövrəsi olan yeri.
[2] "əl-Bəqərə" surəsi, 127.
[3] Kəbə və onun ətrafı.
[4] Qüdsdəki məscid.
[5] Namazları vaxtında qılmaq nəzərdə tutulur.
[6] Tərcüməsi: Allahım, İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Muhəmmədə, onun zövcələrinə və nəslinə də xeyir-dua ver! İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Muhəmmədə, onun zövcələrinə və nəslinə də bərəkət ver! Həqiqətən də, Sən Tərifəlayiqsən, Şan-şöhrətlisən!

**1414.** Rəvayət edilir ki, ibn Abbas ﵄ demişdir: "Peyğəmbər ﷺ Həsən və Hüseyni ﵄ (şeytan əməlindən) qorumaq üçün dua edib deyərdi: "Babanız (İbrahim öz övladları) İsmail və İshaqı qorumaq məqsədilə dua edib deyərdi: "Əuzu bikəlimatillahit-tamməti min kulli şeytanin və hammətin, və min kulli aynin lammətin.[1]" (əl-Buxari, 3371)

## ٤ – باب: قَوْلُهُ عَزَّ وَجَلَّ: ﴿وَنَبِّئْهُمْ عَن ضَيْفِ إِبْرَٰهِيمَ﴾ وَ قَوْلُهُ: ﴿وَإِذْ قَالَ إِبْرَٰهِـۧمُ رَبِّ أَرِنِي كَيْفَ تُحْيِ ٱلْمَوْتَىٰ﴾

## 4-cü fəsil. Qüdrətli və Böyük Allahın: "Onlara İbrahimin qonaqları barəsində də xəbər ver"[2] sözü, habelə: "İbrahim dedi: "Ey Rəbbim, ölüləri necə diriltdiyini mənə göstər!"[3] sözü

١٤١٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «نَحْنُ أَحَقُّ مِنْ إِبْرَاهِيمَ إِذْ قَالَ: ﴿وَإِذْ قَالَ إِبْرَٰهِـۧمُ رَبِّ أَرِنِي كَيْفَ تُحْيِ ٱلْمَوْتَىٰ قَالَ أَوَلَمْ تُؤْمِن قَالَ بَلَىٰ وَلَٰكِن لِّيَطْمَئِنَّ قَلْبِي﴾ وَيَرْحَمُ اللَّهُ لُوطًا، لَقَدْ كَانَ يَأْوِي إِلَى رُكْنٍ شَدِيدٍ وَلَوْ لَبِثْتُ فِي السِّجْنِ طُولَ مَا لَبِثَ يُوسُفُ لأَجَبْتُ الدَّاعِيَ». [رواه البخاري: ٣٣٧٢]

**1415.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bizim İbrahimdən daha çox belə deməyə haqqımız çatır: "Ey Rəbbim, ölüləri necə diriltdiyini mənə göstər!" *Rəbbi ona*: "Məgər sən inanmırsan?"– dedi. *İbrahim* dedi: "Əlbəttə *inanıram!* Amma *istəyirəm ki,* qəlbim rahat olsun"[4]. Allah Luta rəhmət eləsin! Həqiqətən, o, möhkəm bir dayağa söykənirdi[5]. Əgər mən Yusuf qədər zindanda qalsaydım, (sonra da padşahın elçisi gəlib məni çağırmış olsaydı,) mən onun çağırışını dərhal qəbul edərdim." (əl-Buxari, 3372)

## ٥ – باب: قَوْلُ اللهِ تَعَالَى: ﴿وَٱذْكُرْ فِي ٱلْكِتَٰبِ إِسْمَٰعِيلَ إِنَّهُۥ كَانَ صَادِقَ ٱلْوَعْدِ﴾

## 5-ci fəsil. Uca Allahın: "Kitabda İsmaili də xatırla! Həqiqətən, o öz vədinə sadiq idi..."[6] sözü

١٤١٦ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ قَالَ: مَرَّ النَّبِيُّ ﷺ عَلَى نَفَرٍ مِنْ أَسْلَمَ يَنْتَضِلُونَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «ارْمُوا بَنِي إِسْمَاعِيلَ، فَإِنَّ أَبَاكُمْ كَانَ رَامِيًا، وَأَنَا مَعَ بَنِي فُلاَنٍ». قَالَ فَأَمْسَكَ أَحَدُ الْفَرِيقَيْنِ بِأَيْدِيهِمْ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَا لَكُمْ لاَ تَرْمُونَ». فَقَالُوا يَا رَسُولَ اللَّهِ، نَرْمِي وَأَنْتَ مَعَهُمْ قَالَ: «ارْمُوا وَأَنَا مَعَكُمْ كُلِّكُمْ». [رواه البخاري: ٣٣٧٣]

---

[1] Tərcüməsi: Hər bir şeytandan, zərərli həşəratdan və hər pis gözdən (qorunmaq üçün) Allahın tam kəlmələrinə sığınıram.

[2] "əl-Hicr" surəsi, 120.

[3] "əl-Bəqərə" surəsi, 260.

[4] "əl-Bəqərə" surəsi, 260.

[5] Quranda deyilir: "*Lut* dedi: "Kaş ki, sizə çatan bir qüvvəm olaydı, yaxud möhkəm bir dayağa söykənəydim!" "Hud" surəsi, 80.

[6] "Məryəm" surəsi, 54.

**1416.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ Əsləm qəbiləsindən olan, öz aralarında ox atma yarışı keşirən bir neçə adamın yanından keçərkən dedi: "Atın, ey İsmail oğulları! Həqiqətən, sizin babanız (mahir) oxçu olmuşdur. Mən filan qəbiləni dəstəkləyəcəyəm." (Bunu eşidəndə) dəstələrdən biri əl saxladı. Peyğəmbər ﷺ soruşdu: "Nə oldu sizə, niyə atmırsınız?" Onlar dedilər: "Ya Rəsulullah, sən onların tərəfində ola-ola biz necə ata bilərik?!" Peyğəmbər ﷺ dedi: "Atın, mən sizin hamınızı dəstəkləyirəm!" (əl-Buxari, 3373)

## ٦- باب: قَوْلُ اللهِ تَعَالَى: ﴿وَإِلَىٰ ثَمُودَ أَخَاهُمْ صَٰلِحًا﴾

## 6-cı fəsil. Uca Allahın: "Səmud qövmünə də qardaşları Salehi *göndərdik*"[1] sözü

١٤١٧ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ لَمَّا نَزَلَ الْحِجْرَ فِي غَزْوَةِ تَبُوكَ أَمَرَهُمْ أَنْ لاَ يَشْرَبُوا مِنْ بِئْرِهَا، وَلاَ يَسْتَقُوا مِنْهَا فَقَالُوا قَدْ عَجَنَّا مِنْهَا، وَاسْتَقَيْنَا. فَأَمَرَهُمْ أَنْ يَطْرَحُوا ذَلِكَ الْعَجِينَ وَيُهَرِيقُوا ذَلِكَ الْمَاءَ. [رواه البخاري: ٣٣٧٨]

**1417.** İbn Ömər رضي الله عنهما rəvayət etmişdir ki, Peyğəmbər ﷺ Təbuka yürüş edərkən Hicr deyilən yerə[2] gəlib çatdıqda əshabələrə oradakı quyudan su içməməyi və ehtiyat üçün su götürməməyi əmr etdi. Onlar dedilər: "Artıq bu su ilə həm xəmir yoğurmuşuq, həm də (tuluqlarımızı) doldurmuşuq." Onda Peyğəmbər ﷺ onlara xəmiri tullamağı, suyu da boşaltmağı əmr etdi. (əl-Buxari, 3378)

## ٧- باب: ﴿أَمْ كُنتُمْ شُهَدَآءَ إِذْ حَضَرَ يَعْقُوبَ ٱلْمَوْتُ﴾ الآيَة

## 7-ci fəsil. "Yoxsa siz Yaquba ölüm gəldikdə *onun* yanında idiniz?..."[3] ayəsi axıradək

١٤١٨ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ: «الْكَرِيمُ ابْنُ الْكَرِيمِ ابْنِ الْكَرِيمِ ابْنِ الْكَرِيمِ يُوسُفُ ابْنُ يَعْقُوبَ بْنِ إِسْحَاقَ بْنِ إِبْرَاهِيمَ عليه السلام». [رواه البخاري: ٣٣٨٢]

**1418.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İbrahimin oğlu İshaq, onun oğlu Yaqub, onun da oğlu Yusuf, möhtərəm peyğəmbərdir, (özü də) möhtərəm (peyğəmbərin) oğludur, (atası da) möhtərəm (peyğəmbərin) oğludur, (babası da) möhtərəm (peyğəmbərin) oğludur." (əl-Buxari, 3382)

## ٨- باب: حَدِيثُ الْخَضِرِ مَعَ مُوسَى عليهما السلام

## 8-ci fəsil. Xədirlə[4] Musanın عليهما السلام əhvalatı

١٤١٩ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنَّمَا سُمِّيَ الْخَضِرُ أَنَّهُ جَلَسَ عَلَى فَرْوَةٍ بَيْضَاءَ فَإِذَا هِيَ تَهْتَزُّ مِنْ خَلْفِهِ خَضْرَاءَ». [رواه البخاري: ٣٤٠٢]

---

[1] "Hud" surəsi, 61.
[2] Bura vaxtı ilə Səmud qövmünün yaşadığı yerdir.
[3] "əl-Bəqərə" surəsi, 133.
[4] Hərfi tərcümədə "yaşıl" deməkdir.

**1419.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Xədirə belə bir adın verilməsinin səbəbi bu idi ki, (bir dəfə) o, (ot bitməyən) ağ torpaqda oturmuş və birdən onun arxa tərəfində (hər yan) yaşıllaşmışdı." (əl-Buxari, 3402)

## 9-cu fəsil

## ٩– باب

١٤٢٠ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: كُنَّا مَعَ رَسُولِ اللَّهِ ﷺ نَجْنِى الْكَبَاثَ، وَإِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «عَلَيْكُمْ بِالأَسْوَدِ مِنْهُ، فَإِنَّهُ أَطْيَبُهُ». قَالُوا أَكُنْتَ تَرْعَى الْغَنَمَ قَالَ: «وَهَلْ مِنْ نَبِيٍّ إِلاَّ وَقَدْ رَعَاهَا». [رواه البخاري: ٣٤٠٦]

**1420.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "(Bir dəfə) biz Ərak ağacının yetişmiş meyvəsini dərirdik. Onda Peyğəmbər ﷺ buyurdu: "Qara rəngdə olanını götürün, çünki bunlar (meyvənin) ən ləzzətlisidir." (Əshabələr) soruşdular: "(Ey Allahın elçisi) sən qoyun otarmısanmı?" Peyğəmbər ﷺ dedi: "Heç elə bir peyğəmbər olubmu ki, qoyun otarmasın?!" (əl-Buxari, 3406)

## 10-cu fəsil. Uca Allahın: "Allah iman gətirənlərə isə Fironun zövcəsini misal çəkdi..." ayəsindən "...və itaət edənlərdən oldu"[1] ayəsinədək

## ١٠– باب: قَوْلُ اللهِ تَعَالَى: ﴿وَضَرَبَ ٱللَّهُ مَثَلًا لِّلَّذِينَ ءَامَنُواْ ٱمْرَأَتَ فِرْعَوْنَ﴾ إِلَى قَوْلِهِ ﴿وَكَانَتْ مِنَ ٱلْقَٰنِتِينَ﴾

١٤٢١ – عَنْ أَبِى مُوسَى رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «كَمَلَ مِنَ الرِّجَالِ كَثِيرٌ، وَلَمْ يَكْمُلْ مِنَ النِّسَاءِ إِلاَّ آسِيَةُ امْرَأَةُ فِرْعَوْنَ، وَمَرْيَمُ بِنْتُ عِمْرَانَ، وَإِنَّ فَضْلَ عَائِشَةَ عَلَى النِّسَاءِ كَفَضْلِ الثَّرِيدِ عَلَى سَائِرِ الطَّعَامِ». [رواه البخاري: ٣٤١١]

**1421.** Əbu Musa رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kişilərdən bir çoxları kamilliyə çatmışdır. Qadınlardan isə yalnız Fironun həyat yoldaşı Asiya və İmranın qızı Məryəm kamilliyə çatmışdır. Aişənin digər qadınlardan üstünlüyü isə, ətli şorbanın başqa yeməklərdən üstünlüyü kimidir." (əl-Buxari, 3411)

## 11-ci fəsil. Uca Allahın: "Yunus da, həqiqətən, elçilərdəndir..." ayəsindən "...O, qınanmağa layiq olduqda balıq onu uddu"[2] ayəsinədək

## ١١– باب: قَوْلُ اللهِ تَعَالَى: ﴿وَإِنَّ يُونُسَ لَمِنَ ٱلْمُرْسَلِينَ﴾ إِلَى قَوْلِهِ ﴿فَٱلْتَقَمَهُ ٱلْحُوتُ وَهُوَ مُلِيمٌ﴾

١٤٢٢ – عَنِ ابْنِ عَبَّاسٍ رضي الله عنهما عَنِ النَّبِيِّ ﷺ قَالَ «مَا يَنْبَغِى لِعَبْدٍ أَنْ يَقُولَ إِنِّى خَيْرٌ مِنْ يُونُسَ بْنِ مَتَّى». وَنَسَبَهُ إِلَى أَبِيهِ. [رواه البخاري: ٣٤١٣]

[1] "ət-Təhrim" surəsi, 11-12.
[2] "əs-Saffat" surəsi, 139-142.

**1422.** İbn Abbas rəvayət edir ki, Peyğəmbər ﷺ: "Heç kəsə: "Mən Yunus ibn Məttadan daha xeyirliyəm!"– demək yaraşmaz!"– deyə buyurmuş və onu atasına aid etmişdir. (əl-Buxari, 3413)

## 12-ci fəsil. Uca Allahın: "...və Davuda Zəbur verdik.."[1] sözü

## ١٢– باب: قَوْلُ اللهِ تَعَالَى: ﴿وَءَاتَيْنَا دَاوُۥدَ زَبُورًا﴾

١٤٢٣ – عَنْ أَبِي هُرَيْرَةَ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «خُفِّفَ عَلَى دَاوُدَ الْقُرْآنُ، فَكَانَ يَأْمُرُ بِدَوَابِّهِ فَتُسْرَجُ، فَيَقْرَأُ الْقُرْآنَ قَبْلَ أَنْ تُسْرَجَ دَوَابُّهُ، وَلاَ يَأْكُلُ إِلاَّ مِنْ عَمَلِ يَدِهِ». [رواه البخاري: ٣٤١٧]

**1423.** Əbu Hureyra rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Zəburu oxumaq Davuda asanlaşdırılmışdı. Çox vaxt o, atların yəhərlənməsini əmr edər və atlar yəhərlənməmişdən əvvəl Zəburu oxuyub bitirərdi. O ancaq öz əlləri ilə qazandığı (ruzidən) yeyərdi." (əl-Buxari, 3417)

## 13-cü fəsil. Uca Allahın: "Biz Davuda Süleymanı bəxş etdik. O necə də gözəl qul idi! Daima *Allaha* üz tutardı"[2] sözü

## ١٣– باب: قَوْلُ اللهِ تَعَالَى: ﴿وَوَهَبْنَا لِدَاوُۥدَ سُلَيْمَٰنَ نِعْمَ ٱلْعَبْدُ إِنَّهُۥٓ أَوَّابٌ﴾

١٤٢٤ – (أ)- عَنْ أَبِي هُرَيْرَةَ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «مَثَلِي وَمَثَلُ النَّاسِ كَمَثَلِ رَجُلٍ اسْتَوْقَدَ نَارًا، فَجَعَلَ الْفَرَاشُ وَهَذِهِ الدَّوَابُّ تَقَعُ فِي النَّارِ». [رواه البخاري: ٣٤٢٦]

**1424.** (a) – Rəvayət edilir ki, Əbu Hureyra Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Mənimlə ümmətimdən (olan günahkarların) məsəli od qalamış bir kimsə ilə həmin oda düşən pərvanələrin və həşəratların məsəlinə bənzəyir."[3] (əl-Buxari, 3427)

١٤٢٤ – (ب)- وَ فِي رِوَايَةٍ قَالَ: «كَانَتِ امْرَأَتَانِ مَعَهُمَا ابْنَاهُمَا جَاءَ الذِّئْبُ فَذَهَبَ بِابْنِ إِحْدَاهُمَا، فَقَالَتْ صَاحِبَتُهَا إِنَّمَا ذَهَبَ بِابْنِكِ. وَقَالَتِ الأُخْرَى إِنَّمَا ذَهَبَ بِابْنِكِ. فَتَحَاكَمَتَا إِلَى دَاوُدَ، فَقَضَى بِهِ لِلْكُبْرَى فَخَرَجَتَا عَلَى سُلَيْمَانَ بْنِ دَاوُدَ فَأَخْبَرَتَاهُ. فَقَالَ ائْتُونِي بِالسِّكِّينِ أَشُقُّهُ بَيْنَهُمَا. فَقَالَتِ الصُّغْرَى لاَ تَفْعَلْ يَرْحَمُكَ اللَّهُ، هُوَ ابْنُهَا. فَقَضَى بِهِ لِلصُّغْرَى». [رواه البخاري: ٣٤٢٧]

**1424.** (b) – Digər rəvayətdə Peyğəmbər ﷺ demişdir: "İki qadın və bu qadınların hər birinin bir uşağı var idi. (Birdən) bir canavar gəlib onlardan birinin uşağını apardı. Rəfiqəsi ona dedi: "Canavar sənin uşağını apardı." O biri qadın

---

[1] "ən-Nisa" surəsi, 163 və "əl-İsra" surəsi, 55.

[2] "Sad" surəsi, 30.

[3] Peyğəmbər ﷺ demişdir: "Mənimlə ümmətimin məsəli od qaladıqdan sonra həşəratları və pərvanələri həmin oddan uzaqlaşdıran kimsənin məsəlinə bənzəyir. Mən sizin qurşağınızdan tutub kənara çəkirəm, siz isə özünüzü oda atırsınız" (Səhih Muslim).

dedi: "(Xeyr,) o sənin uşağını apardı." Sonra da mühakimə olunmaq üçün Davuda müraciət etdilər. Davud hökmü yaşca böyük olan qadının lehinə kəsdi. Sonra bu qadınlar Süleymanın yanına gəlib məsələdən onu agah etdilər. Süleyman buyurdu: "Mənə bıçaq gətirin, onu bunların arasında iki yerə bölüm." (Bunu eşidəndə) yaşca kiçik olan qadın dedi: "Eləmə (bunu), Allah sənə rəhm etsin, uşaq onundur." Beləliklə, Süleyman uşağın yaşca kiçik qadına aid olduğuna hökm verdi." (əl-Buxari, 3427)

## ١٤ – باب: قَوْلُهُ تَعَالَى:

﴿وَإِذْ قَالَتِ ٱلْمَلَٰٓئِكَةُ يَٰمَرْيَمُ إِنَّ ٱللَّهَ ٱصْطَفَىٰكِ وَطَهَّرَكِ وَٱصْطَفَىٰكِ عَلَىٰ نِسَآءِ ٱلْعَٰلَمِينَ ﴿٤٢﴾ يَٰمَرْيَمُ ٱقْنُتِى لِرَبِّكِ وَٱسْجُدِى وَٱرْكَعِى مَعَ ٱلرَّٰكِعِينَ ﴿٤٣﴾ ذَٰلِكَ مِنْ أَنۢبَآءِ ٱلْغَيْبِ نُوحِيهِ إِلَيْكَ ۚ وَمَا كُنتَ لَدَيْهِمْ إِذْ يُلْقُونَ أَقْلَٰمَهُمْ أَيُّهُمْ يَكْفُلُ مَرْيَمَ﴾

## 14-cü fəsil. Uca Allahın: "Bir zaman mələklər dedilər: "Ey Məryəm! Həqiqətən, Allah səni seçdi, təmizlədi və seçib aləmlərin qadınlarından üstün etdi. Ey Məryəm! Rəbbinə itaət et, səcdə qıl və rükuya gedənlərlə birlikdə rükuya get!" Bunlar qeyb xəbərlərindəndir ki, onu sənə vəhy edirik. Hansının Məryəmi himayə edəcəyi barədə qələmlərini *püşk* atdıqları zaman sən onların yanında deyildin..."[1] sözü

١٤٢٥ – عَنْ عَلِيٍّ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «خَيْرُ نِسَائِهَا مَرْيَمُ ابْنَةُ عِمْرَانَ، وَخَيْرُ نِسَائِهَا خَدِيجَةُ». [رواه البخاري: ٣٤٣٢]

**1425.** Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "(Vaxtı ilə dünyada olmuş) qadınların ən xeyirlisi İmranın qızı Məryəmdir. (Bu ümmətin) qadınlarının ən xeyirlisi isə Xədicədir." (əl-Buxari, 3432)

١٤٢٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «نِسَاءُ قُرَيْشٍ خَيْرُ نِسَاءٍ رَكِبْنَ الإِبِلَ، أَحْنَاهُ عَلَى طِفْلٍ، وَأَرْعَاهُ عَلَى زَوْجٍ فِي ذَاتِ يَدِهِ». [رواه البخاري: ٣٤٣٤]

**1426.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qureyş qadınları dəvə minən ən xeyirli qadınlardır[2]. Onlar uşaqlara çox qayğı göstərir və ərlərinin mal-dövlətini göz bəbəyi kimi qoruyurlar." (əl-Buxari, 3434)

---

[1] "Ali-İmran" surəsi, 42-44.
[2] Başqa cür desək "onlar ərəb qadınlarının ən xeyirliləridir"

## 15-ci fəsil. Uca Allahın: “Ey Kitab əhli! Dininizdə ifrata varmayın və Allah barəsində yalnız həqiqəti deyin. Məryəm oğlu İsa Məsih ancaq Allahın elçisi, Onun Məryəmə göndərdiyi *“Ol!”* kəlməsi və Onun tərəfindən *göndərilən* bir ruhdur. Allaha və Onun elçilərinə iman gətirin və: *“Tanrı* üçdür!” deməyin. *Batil əqidənizə* son qoyun! *Bu* sizin üçün xeyirli olar. Həqiqətən, Allah Tək İlahdır! O, pakdır, müqəddəsdir, övladı olmaqdan uzaqdır. Göylərdə və yerdə nə varsa, Ona məxsusdur. Qoruyan olaraq Allah yetər”[1] sözü

## ١٥- باب:
قَوْلُهُ تَعَالَى:
﴿يَٰٓأَهۡلَ ٱلۡكِتَٰبِ لَا تَغۡلُواْ فِي دِينِكُمۡ وَلَا تَقُولُواْ عَلَى ٱللَّهِ إِلَّا ٱلۡحَقَّۚ إِنَّمَا ٱلۡمَسِيحُ عِيسَى ٱبۡنُ مَرۡيَمَ رَسُولُ ٱللَّهِ وَكَلِمَتُهُۥٓ أَلۡقَىٰهَآ إِلَىٰ مَرۡيَمَ وَرُوحٞ مِّنۡهُۖ فَـَٔامِنُواْ بِٱللَّهِ وَرُسُلِهِۦۖ وَلَا تَقُولُواْ ثَلَٰثَةٌۚ ٱنتَهُواْ خَيۡرٗا لَّكُمۡۚ إِنَّمَا ٱللَّهُ إِلَٰهٞ وَٰحِدٞۖ سُبۡحَٰنَهُۥٓ أَن يَكُونَ لَهُۥ وَلَدٞۘ لَّهُۥ مَا فِي ٱلسَّمَٰوَٰتِ وَمَا فِي ٱلۡأَرۡضِۗ وَكَفَىٰ بِٱللَّهِ وَكِيلٗا﴾

١٤٢٧ – عَنْ عُبَادَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «مَنْ شَهِدَ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ، وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ، وَأَنَّ عِيسَى عَبْدُ اللَّهِ وَرَسُولُهُ وَكَلِمَتُهُ، أَلْقَاهَا إِلَى مَرْيَمَ ، وَرُوحٌ مِنْهُ، وَالْجَنَّةُ حَقٌّ وَالنَّارُ حَقٌّ، أَدْخَلَهُ اللَّهُ الْجَنَّةَ عَلَى مَا كَانَ مِنَ الْعَمَلِ». [رواه البخاري: ٣٤٣٥]

**1427.** Ubadə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim Allahdan başqa heç bir məbudun olmadığına, Onun Tək olduğuna və heç bir şəriki olmadığına, Muhəmmədin Onun qulu və elçisi olduğuna, İsanın Allahın qulu, elçisi, Məryəmə göndərdiyi kəlməsi və Onun ruhundan olduğuna, Cənnətin haqq, Cəhənnəmin də haqq olduğuna şahidlik etsə, nə əməl etmiş olursa-olsun, Allah onu Cənnətə daxil edər.” (əl-Buxari, 3435)

## 16-cı fəsil. Uca Allahın: “Kitabda Məryəmi də yada sal. O zaman o, ailəsindən *ayrılıb* şərq tərəfdə olan bir yerə çəkilmiş...”[2] sözü

## ١٦- باب:
قَوْلُ اللهِ تَعَالَى: ﴿وَٱذۡكُرۡ فِي ٱلۡكِتَٰبِ مَرۡيَمَ إِذِ ٱنتَبَذَتۡ مِنۡ أَهۡلِهَا مَكَانٗا شَرۡقِيّٗا ١٦﴾

١٤٢٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لَمْ يَتَكَلَّمْ فِي الْمَهْدِ إِلاَّ ثَلاَثَةٌ عِيسَى، وَكَانَ فِي بَنِي إِسْرَائِيلَ رَجُلٌ يُقَالُ لَهُ جُرَيْجٌ، كَانَ يُصَلِّي، فَجَاءَتْهُ أُمُّهُ فَدَعَتْهُ، فَقَالَ أُجِيبُهَا أَوْ أُصَلِّي. فَقَالَتِ اللَّهُمَّ لاَ تُمِتْهُ حَتَّى تُرِيَهُ وُجُوهَ الْمُومِسَاتِ. وَكَانَ جُرَيْجٌ فِي صَوْمَعَتِهِ، فَتَعَرَّضَتْ لَهُ امْرَأَةٌ وَكَلَّمَتْهُ فَأَبَى، فَأَتَتْ رَاعِيًا، فَأَمْكَنَتْهُ مِنْ نَفْسِهَا فَوَلَدَتْ غُلاَمًا، فَقَالَتْ مِنْ جُرَيْجٍ. فَأَتَوْهُ فَكَسَرُوا صَوْمَعَتَهُ، وَأَنْزَلُوهُ وَسَبُّوهُ، فَتَوَضَّأَ وَصَلَّى ثُمَّ أَتَى

[1] “ən-Nisa” surəsi, 171.
[2] “Məryəm” surəsi, 16.

الْغُلاَمَ فَقَالَ مَنْ أَبُوكَ يَا غُلاَمُ قَالَ الرَّاعِى. قَالُوا نَبْنِى صَوْمَعَتَكَ مِنْ ذَهَبٍ. قَالَ لاَ إِلاَّ مِنْ طِينٍ. وَكَانَتِ امْرَأَةٌ تُرْضِعُ ابْنًا لَهَا مِنْ بَنِى إِسْرَائِيلَ، فَمَرَّ بِهَا رَجُلٌ رَاكِبٌ ذُو شَارَةٍ، فَقَالَتِ اللَّهُمَّ اجْعَلِ ابْنِى مِثْلَهُ. فَتَرَكَ ثَدْيَهَا، وَأَقْبَلَ عَلَى الرَّاكِبِ فَقَالَ اللَّهُمَّ لاَ تَجْعَلْنِى مِثْلَهُ. ثُمَّ أَقْبَلَ عَلَى ثَدْيِهَا يَمَصُّهُ - قَالَ أَبُو هُرَيْرَةَ كَأَنِّى أَنْظُرُ إِلَى النَّبِىِّ ﷺ يَمَصُّ إِصْبَعَهُ - ثُمَّ مُرَّ بِأَمَةٍ فَقَالَتِ اللَّهُمَّ لاَ تَجْعَلِ ابْنِى مِثْلَ هَذِهِ. فَتَرَكَ ثَدْيَهَا فَقَالَ اللَّهُمَّ اجْعَلْنِى مِثْلَهَا. فَقَالَتْ لِمَ ذَاكَ فَقَالَ الرَّاكِبُ جَبَّارٌ مِنَ الْجَبَابِرَةِ، وَهَذِهِ الأَمَةُ يَقُولُونَ سَرَقْتِ زَنَيْتِ. وَلَمْ تَفْعَلْ».
[رواه البخاري: ٣٤٣٦]

**1428.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Beşikdə olan körpələrdən ancaq üçü[1] danışmışdır. (Onlardan biri) İsadır. (İkincisinə gəlincə,) İsrail oğulları arasında Cureyc adlı bir (rahib) var idi. (Bir dəfə) o namaz qılarkən anası gəlib onu çağırdı. O öz-özünə dedi: “Anama cavab verim, ya namazımı davam edim?” Anası dua edib dedi: “Allahım, oğlum pozğun qadınların üzünə baxmayınca, onun canını alma!” Bir dəfə Cureyc öz komasında ikən (pozğun) bir qadın gəlib onu yoldan çıxartmaq istədi, lakin o imtina etdi. Belə olduqda qadın bir çobanın yanına gedib onunla yaxınlıq etdi və (bir müddət keçdikdən sonra) dünyaya uşaq gətirdi. (Camaat ondan uşağın kimdən olduğunu soruşduqda): “Cureycdəndir!”- dedi. Camaat gedib onun komasını dağıtdı, özünü də oradan bayıra atdı və onu söyüb biyabır etdi. Onda Cureyc dəstəmaz alıb namaz qıldı, sonra da dünyaya gəlmiş körpənin yanına gəlib dedi: “Atan kimdir, ay uşaq?” Uşaq: “Çobandır”- dedi. (Kənd əhalisi ona): “İstəyirsənsə, sənə qızıldan koma quraq?”- deyə təklif etdi. O: “Xeyr, ancaq gildən olsun!”– dedi.

(O ki qaldı üçüncü körpəyə,) İsrail oğullarından olan bir qadın öz uşağını əmizdirərkən yaraşıqlı bir atlı onun yanından keçdi. Uşağın anası (atlını görüb) dedi: “Allahım, mənim oğlumu da bunun kimi et!” Bu vaxt uşaq anasının döşünü buraxıb atlıya tərəf üz tutdu və dedi: “Allahım, məni onun kimi etmə!”

Əbu Hureyra dedi: “Mən sanki Peyğəmbərin ﷺ öz barmağını sovurduğunu görürəm.”

(Peyğəmbər ﷺ) dedi: “Sonra bir kəniz oradan keçdi və uşağın anası dedi: “Allahım, mənim oğlumu bunun kimi etmə!” Bu vaxt uşaq anasının döşünü buraxıb dedi: “Allahım, məni onun kimi et!” Sonra yenə anasının döşünü əmməyə başladı. Anası dedi: “Niyə belə?” Uşaq dedi: “O atlı qəddar adamlardan biridir. Bu kəniz barəsində isə: “O, zina edib, oğurluq edib”- deyirlər, halbuki o belə bir iş tutmayıb.” (əl-Buxari, 3436)

١٤٢٩ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «رَأَيْتُ عِيسَى وَمُوسَى وَإِبْرَاهِيمَ، فَأَمَّا عِيسَى فَأَحْمَرُ جَعْدٌ عَرِيضُ الصَّدْرِ، وَأَمَّا مُوسَى فَآدَمُ جَسِيمٌ سَبْطٌ كَأَنَّهُ مِنْ رِجَالِ الزُّطِّ». [رواه البخاري: ٣٤٣٨]

**1429.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən İsanı, Musanı və İbrahimi gördüm. İsa qırmızıdərili, dolubədənli və enlikürək birisi idi. Musa isə qarayanız, cüssəli və hamar saçları olan birisi idi. Zutlardan[2] birinə oxşayırdı.” (əl-Buxari, 3438)

---

[1] Burada ancaq İsrail oğullarından olan körpələr nəzərdə tutulur.
[2] Sudandakı və ya Hindistandakı tayfalardan biri.

١٤٣٠ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «وَأَرَانِى اللَّيْلَةَ عِنْدَ الْكَعْبَةِ فِى الْمَنَامِ، فَإِذَا رَجُلٌ آدَمُ كَأَحْسَنِ مَا يُرَى مِنْ أُدْمِ الرِّجَالِ، تَضْرِبُ لِمَّتُهُ بَيْنَ مَنْكِبَيْهِ، رَجِلُ الشَّعَرِ، يَقْطُرُ رَأْسُهُ مَاءً، وَاضِعًا يَدَيْهِ عَلَى مَنْكِبَىْ رَجُلَيْنِ وَهُوَ يَطُوفُ بِالْبَيْتِ. فَقُلْتُ مَنْ هَذَا فَقَالُوا هَذَا الْمَسِيحُ ابْنُ مَرْيَمَ. ثُمَّ رَأَيْتُ رَجُلاً وَرَاءَهُ جَعْدًا قَطَطًا أَعْوَرَ عَيْنِ الْيُمْنَى كَأَشْبَهِ مَنْ رَأَيْتُ بِابْنِ قَطَنٍ، وَاضِعًا يَدَيْهِ عَلَى مَنْكِبَىْ رَجُلٍ، يَطُوفُ بِالْبَيْتِ، فَقُلْتُ مَنْ هَذَا قَالُوا الْمَسِيحُ الدَّجَّالُ». [رواه البخاري: ٣٤٤٠]

**1430.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən keçən gecə Kəbənin yanında yatarkən yuxuda qarayanız bir adam gördüm. (Bu adam) qarayanız adamların ən gözəli idi. Saçları kürəyinin arasına düşürdü, həm də daranmış idi, başından da su damırdı. Özü də əllərini iki kişinin çiyninə qoymuş halda Kəbəni təvaf edirdi. Mən soruşdum: “Bu kimdir?” Dedilər: “Bu, Məryəm oğlu Məsihdir!” Sonra mən onun arxasında buruqsaç və sağ gözü kor olan, özü də ibn Qatana[1] bənzəyən birisini gördüm. Adam əllərini bir kişinin çiyninə qoymuş halda Kəbəni təvaf edirdi. Mən soruşdum: “Bu kimdir?” Dedilər: “Məsihid-dəccaldır!” (əl-Buxari, 3440)

١٤٣١ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: لاَ وَاللَّهِ مَا قَالَ النَّبِىُّ ﷺ لِعِيسَى أَحْمَرُ، وَلَكِنْ قَالَ: «بَيْنَمَا أَنَا نَائِمٌ أَطُوفُ بِالْكَعْبَةِ، فَإِذَا رَجُلٌ آدَمُ سَبْطُ الشَّعَرِ، يُهَادَى بَيْنَ رَجُلَيْنِ، يَنْطِفُ رَأْسُهُ مَاءً أَوْ يُهَرَاقُ رَأْسُهُ مَاءً فَقُلْتُ مَنْ هَذَا قَالُوا ابْنُ مَرْيَمَ، فَذَهَبْتُ أَلْتَفِتُ، فَإِذَا رَجُلٌ أَحْمَرُ جَسِيمٌ، جَعْدُ الرَّأْسِ ، أَعْوَرُ عَيْنِهِ الْيُمْنَى، كَأَنَّ عَيْنَهُ عِنَبَةٌ طَافِيَةٌ. قُلْتُ مَنْ هَذَا قَالُوا هَذَا الدَّجَّالُ. وَأَقْرَبُ النَّاسِ بِهِ شَبَهًا ابْنُ قَطَنٍ». [رواه البخاري: ٣٤٤١]

**1431.** Digər rəvayətdə ibn Ömər رضي الله عنهما demişdir: “Xeyr, vallahi, Peyğəmbər ﷺ İsanın qırmızıdərili olduğunu deməmişdir, lakin o demişdir: “Mən yuxuda Kəbəni təvaf edərkən birdən qarşımda qarayanız, saçları düz olan bir adam gördüm. İki nəfərə söykənmiş halda gedirdi, başından da su damırdı. Mən soruşdum: “Bu kimdir?” Dedilər: “Bu, Məryəmin oğludur!” Sonra dönüb qarşımda qırmızıdərili, cüssəli, buruqsaç və sağ gözü kor olan birisini gördüm. Onun gözü sanki domba üzüm dənəsi idi. Mən soruşdum: “Bu kimdir?” Dedilər: “Bu, dəccaldır!” İnsanların ona ən çox oxşayanı isə ibn Qatandır.” (əl-Buxari, 3441)

١٤٣٢ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «أَنَا أَوْلَى النَّاسِ بِابْنِ مَرْيَمَ، وَالأَنْبِيَاءُ أَوْلاَدُ عَلاَّتٍ، لَيْسَ بَيْنِى وَبَيْنَهُ نَبِىٌّ». [رواه البخاري: ٣٤٤٢]

**1432.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “İnsanların Məryəm oğluna ən yaxın olanı mənəm. (Ümumiyyətlə) peyğəmbərlər ata bir, ana ayrı[2] övladlardır. Mənimlə onun arasında heç bir peyğəmbər olmamışdır.” (əl-Buxari, 3442)

١٤٣٣ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَنَا أَوْلَى النَّاسِ بِعِيسَى ابْنِ مَرْيَمَ فِى الدُّنْيَا وَالآخِرَةِ، وَالأَنْبِيَاءُ إِخْوَةٌ لِعَلاَّتٍ، أُمَّهَاتُهُمْ شَتَّى، وَدِينُهُمْ وَاحِدٌ». [رواه البخاري: ٣٤٤٣]

**1433.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Dünyada da, axirətdə də insanların Məryəm oğlu İsaya ən yaxın olanı mənəm. (Əslində) peyğəmbərlər ata bir, ana ayrı övladlardır. Anaları ayrı olsa da, dinləri birdir.” (əl-Buxari, 3443)

---

[1] İbn Qatan Xuzaə qəbiləsindən olmuş və hələ İslam gəlməmişdən əvvəl vəfat etmişdir.
[2] Yəni əqidələri bir, şəriət qayda-qanunları isə ayrıdır.

١٤٣٤ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «رَأَى عِيسَى ابْنُ مَرْيَمَ رَجُلاً يَسْرِقُ، فَقَالَ لَهُ أَسَرَقْتَ قَالَ كَلاَّ وَاللَّهِ الَّذِى لاَ إِلَهَ إِلاَّ هُوَ. فَقَالَ عِيسَى آمَنْتُ بِاللَّهِ وَكَذَّبْتُ عَيْنِى». [رواه البخاري: ٣٤٤٤]

**1434.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məryəm oğlu İsa bir adamın oğurluq etdiyini görüb ona dedi: "Sən oğurluq edirsən?" Adam dedi: "Xeyr! Özündən başqa heç bir məbud olmayan Allaha and olsun ki, (oğurluq etmirəm)!" Onda İsa dedi: "Allaha iman gətirdim və gözlərimi yalançı hesab etdim." (əl-Buxari, 3444)

١٤٣٥ – عَنْ عُمَرَ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «لاَ تُطْرُونِى كَمَا أَطْرَتِ النَّصَارَى ابْنَ مَرْيَمَ، فَإِنَّمَا أَنَا عَبْدُهُ، فَقُولُوا عَبْدُ اللَّهِ وَرَسُولُهُ». [رواه البخاري: ٣٤٤٥]

**1435.** Rəvayət edilir ki, Ömər ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Xristianlar Məryəm oğlunu şişirtdikləri kimi, siz də məni şişirtməyin! Mən sadəcə Allahın quluyam. Elə isə (mənə): "Allahın qulu və rəsulu!"-deyin." (əl-Buxari, 3445)

## ١٧ – باب: نُزُولُ عِيسَى ابْنِ مَرْيَمَ عليه السلام

## 17-ci fəsil. Məryəm oğlu İsanın عليه السلام (yerə) enməsi

١٤٣٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «كَيْفَ أَنْتُمْ إِذَا نَزَلَ ابْنُ مَرْيَمَ فِيكُمْ وَإِمَامُكُمْ مِنْكُمْ». [رواه البخاري: ٣٤٤٩]

**1436.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məryəm oğlu (İsa) yanınıza nazil olacağı, üstəlik sizə imamlıq edən adamın öz içinizdən olacağı zaman sizin halınız necə olacaq?![1]" (əl-Buxari, 3449)

## ١٨ – باب: مَا ذُكِرَ عَنْ بَنِى إِسْرَائِيلَ

## 18-ci fəsil. İsrail oğulları barəsində deyilənlər

١٤٣٧ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِنَّ مَعَ الدَّجَّالِ إِذَا خَرَجَ مَاءً وَنَارًا، فَأَمَّا الَّذِى يَرَى النَّاسُ أَنَّهَا النَّارُ فَمَاءٌ بَارِدٌ، وَأَمَّا الَّذِى يَرَى النَّاسُ أَنَّهُ مَاءٌ بَارِدٌ فَنَارٌ تُحْرِقُ، فَمَنْ أَدْرَكَ مِنْكُمْ فَلْيَقَعْ فِى الَّذِى يَرَى أَنَّهَا نَارٌ، فَإِنَّهُ عَذْبٌ بَارِدٌ». [رواه البخاري: ٣٤٥٠]

**1437.** Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Dəccal zühur edəcəyi zaman onun yanında su və od olacaq. İnsanlar nəyi od zənn edəcəklərsə, əslində, bu, soyuq su olacaq. Nəyi soyuq su zənn edəcəklərsə, o, yandırıb-yaxan bir od olacaq. Sizlərdən kim o vaxta qədər yaşasa, od zənn etdiyi şeyin içinə girsin. Həqiqətdə, o, şirin və sərin bir su olacaq." (əl-Buxari, 3450)

[1] Yəni təsəvvür edin ki, bu hadisə baş verdikdə müsəlmanlar necə sevinəcək və bununla necə fəxr edəcək.

١٤٣٨ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِنَّ رَجُلاً حَضَرَهُ الْمَوْتُ، فَلَمَّا يَئِسَ مِنَ الْحَيَاةِ أَوْصَى أَهْلَهُ إِذَا أَنَا مُتُّ فَاجْمَعُوا لِي حَطَبًا كَثِيرًا وَأَوْقِدُوا فِيهِ نَارًا حَتَّى إِذَا أَكَلَتْ لَحْمِي، وَخَلَصَتْ إِلَى عَظْمِي، فَامْتَحَشْتُ، فَخُذُوهَا فَاطْحَنُوهَا، ثُمَّ انْظُرُوا يَوْمًا رَاحًا فَاذْرُوهُ فِي الْيَمِّ. فَفَعَلُوا، فَجَمَعَهُ فَقَالَ لَهُ لِمَ فَعَلْتَ ذَلِكَ قَالَ مِنْ خَشْيَتِكَ. فَغَفَرَ اللَّهُ لَهُ». [رواه البخاري: ٣٤٥٢]

**1438.** Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: “Bir adamın ölüm vaxtı gəlib çatmışdı. Adamın artıq yaşamaqdan ümidi kəsildikdə ailəsinə (belə bir) vəsiyyət etdi: “Mən öldükdən sonra çoxlu odun yığıb od qalayarsınız, (sonra da məni bu odda yandırarsınız). Elə ki od mənim ətimi yandırıb sümüyümə çatdı və sümüyümü yandırıb-yaxdı, onları götürün və ovxalayıb toza döndərin, sonra küləkli bir günü gözləyin və həmin tozu dənizə sovurun.” Onlar onun vəsiyyətini yerinə yetirdilər. Lakin Allah onu əvvəlki görkəminə qaytardı və ondan: “Nə üçün belə etdin?”– deyə soruşdu. O: “Səndən qorxduğum üçün!”– deyə cavab verdi. Allah da onu bağışladı.” (əl-Buxari, 3452)

١٤٣٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «كَانَتْ بَنُو إِسْرَائِيلَ تَسُوسُهُمُ الأَنْبِيَاءُ، كُلَّمَا هَلَكَ نَبِيٌّ خَلَفَهُ نَبِيٌّ، وَإِنَّهُ لاَ نَبِيَّ بَعْدِي، وَسَيَكُونُ خُلَفَاءُ فَيَكْثُرُونَ. قَالُوا فَمَا تَأْمُرُنَا قَالَ فُوا بِبَيْعَةِ الأَوَّلِ فَالأَوَّلِ، أَعْطُوهُمْ حَقَّهُمْ، فَإِنَّ اللَّهَ سَائِلُهُمْ عَمَّا اسْتَرْعَاهُمْ». [رواه البخاري: ٣٤٥٥]

**1439.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Əvvəllər İsrail oğullarını peyğəmbərlər idarə edirdilər. Hər dəfə bir peyğəmbər vəfat etdikdə onun yerinə başqa bir peyğəmbər gəlirdi. Məndən sonra isə peyğəmbər gəlməyəcək, lakin çoxlu xəlifələr olacaq.” (Əshabələr) dedilər: “Bizə nə buyurursan?” Peyğəmbər ﷺ dedi: “Birinci beyət edilmiş kimsəyə sadiq qalın, onların haqqını verin. Heç şübhəsiz ki, Allah onları rəiyyətlərinə görə sorğu-sual edəcəkdir.” (əl-Buxari, 3455)

١٤٤٠ – عَنْ أَبِي سَعِيدٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «لَتَتَّبِعُنَّ سَنَنَ مَنْ قَبْلَكُمْ شِبْرًا بِشِبْرٍ، وَذِرَاعًا بِذِرَاعٍ، حَتَّى لَوْ سَلَكُوا جُحْرَ ضَبٍّ لَسَلَكْتُمُوهُ». قُلْنَا يَا رَسُولَ اللَّهِ، الْيَهُودَ وَالنَّصَارَى قَالَ: «فَمَنْ؟». [رواه البخاري: ٣٤٥٦]

**1440.** Əbu Səid ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Siz özünüzdən əvvəlkilərin yolunu tutub qarış-qarış, ərəş-ərəş[1] gedəcəksiniz. Hətta onlar kərtənkələ yuvasına girsələr belə, siz də ora girəcəksiniz” Biz dedik: “Ya Rəsulullah, yəhudiləri və xristianlarımı (qəsd edirsən)?” Dedi: “Başqa kim (ola bilər ki)?!” (əl-Buxari, 3456)

١٤٤١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «بَلِّغُوا عَنِّي وَلَوْ آيَةً، وَحَدِّثُوا عَنْ بَنِي إِسْرَائِيلَ وَلاَ حَرَجَ، وَمَنْ كَذَبَ عَلَيَّ مُتَعَمِّدًا فَلْيَتَبَوَّأْ مَقْعَدَهُ مِنَ النَّارِ». [رواه البخاري: ٣٤٦١]

**1441.** Abdullah ibn Amr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mənim adımdan bir ayə də olsa belə, təbliğ edin. Habelə İsrail oğulları adından hekayətlər danışın (və bilin ki,) bunda da heç bir qəbahət yoxdur. Lakin kim mənim adımdan yalan uydurarsa, qoy Cəhənnəmdə öz yerini tutmağa hazır olsun.” (əl-Buxari, 3461)

[1] 311-ci hədisin qeydlərinə bax.

**١٤٤٢** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِنَّ الْيَهُودَ وَالنَّصَارَى لاَ يَصْبُغُونَ، فَخَالِفُوهُمْ». [رواه البخاري: ٣٤٦٢]

**1442.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yəhudilər və xristianlar (ağ saçlarını) boyamazlar. Siz onlara müxalif olun!" (əl-Buxari, 3462)

**١٤٤٣** – عَنْ جُنْدَب بْنِ جُنَادَة ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «كَانَ فِيمَنْ كَانَ قَبْلَكُمْ رَجُلٌ بِه جُرْحٌ، فَجزِعَ فَأَخَذَ سكِّينًا فَحَزَّ بِهَا يَدَهُ، فَمَا رَقَأَ الدَّمُ حَتَّى مَاتَ، قَالَ اللَّهُ تَعَالَى: بَادَرَنِى عَبْدِى بِنَفْسِهِ، حَرَّمْتُ عَلَيْهِ الْجَنَّةَ». [رواه البخاري: ٣٤٦٣]

**1443.** Cundəb ibn Cunadə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən əvvəl yaşamış insanlar arasında bir nəfər yaralandı. Adam ağrıya dözmədiyindən bıçaq götürüb əlini kəsdi və çoxlu qan itirib öldü. Uca Allah buyurdu: "Qulum canına qəsd etməklə Məni qabaqlamaq istədi, Mən də Cənnəti ona haram etdim!" (əl-Buxari, 3463)

## ١٩– باب: حَدِيثُ أَبْرَصَ وَأَعْمَى وَأَقْرَعَ فِى بَنِى إِسْرَائِيلَ

## 19-cu fəsil. İsrail oğullarından olan cüzam xəstəliyinə tutulmuş adamın, korun və keçəlin hekayəti

**١٤٤٤** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِنَّ ثَلاَثَةً فِى بَنِى إِسْرَائِيلَ أَبْرَصَ وَأَقْرَعَ وَأَعْمَى بَدَا لِلَّه أَنْ يَبْتَلِيَهُمْ، فَبَعَثَ إِلَيْهِمْ مَلَكًا، فَأَتَى الأَبْرَصَ. فَقَالَ أَىُّ شَىْءٍ أَحَبُّ إِلَيْكَ قَالَ لَوْنٌ حَسَنٌ وَجِلْدٌ حَسَنٌ، قَدْ قَذِرَنِى النَّاسُ. قَالَ فَمَسَحَهُ، فَذَهَبَ عَنْهُ، فَأُعْطِىَ لَوْنًا حَسَنًا وَجِلْدًا حَسَنًا. فَقَالَ أَىُّ الْمَالِ أَحَبُّ إِلَيْكَ قَالَ الإِبلُ – أَوْ قَالَ الْبَقَرُ هُوَ شَكَّ فِى ذَلِكَ، إِنَّ الأَبْرَصَ وَالأَقْرَعَ، قَالَ أَحَدُهُمَا الإِبلُ، وَقَالَ الآخَرُ الْبَقَرُ – فَأُعْطِىَ نَاقَةً عُشَرَاءَ. فَقَالَ يُبَارَكُ لَكَ فِيهَا. وَأَتَى الأَقْرَعَ فَقَالَ أَىُّ شَىْءٍ أَحَبُّ إِلَيْكَ قَالَ شَعَرٌ حَسَنٌ، وَيَذْهَبُ عَنِّى هَذَا، قَدْ قَذِرَنِى النَّاسُ. قَالَ فَمَسَحَهُ فَذَهَبَ، وَأُعْطِىَ شَعَرًا حَسَنًا. قَالَ فَأَىُّ الْمَالِ أَحَبُّ إِلَيْكَ قَالَ الْبَقَرُ. قَالَ فَأَعْطَاهُ بَقَرَةً حَامِلاً، وَقَالَ يُبَارَكُ لَكَ فِيهَا. وَأَتَى الأَعْمَى فَقَالَ أَىُّ شَىْءٍ أَحَبُّ إِلَيْكَ قَالَ يَرُدُّ اللَّهُ إِلَىَّ بَصَرِى، فَأُبْصِرُ بِهِ النَّاسَ. قَالَ فَمَسَحَهُ، فَرَدَّ اللَّهُ إِلَيْهِ بَصَرَهُ. قَالَ فَأَىُّ الْمَالِ أَحَبُّ إِلَيْكَ قَالَ الْغَنَمُ. فَأَعْطَاهُ شَاةً وَالِدًا، فَأُنْتِجَ هَذَانِ، وَوَلَّدَ هَذَا، فَكَانَ لِهَذَا وَادٍ مِنْ إِبِلٍ، وَلِهَذَا وَادٍ مِنْ بَقَرٍ، وَلِهَذَا وَادٍ مِنَ الْغَنَمِ. ثُمَّ إِنَّهُ أَتَى الأَبْرَصَ فِى صُورَتِهِ وَهَيْئَتِهِ فَقَالَ رَجُلٌ مِسْكِينٌ، تَقَطَّعَتْ بِىَ الْحِبَالُ فِى سَفَرِى، فَلاَ بَلاَغَ الْيَوْمَ إِلاَّ بِاللَّهِ ثُمَّ بِكَ، أَسْأَلُكَ بِالَّذِى أَعْطَاكَ اللَّوْنَ الْحَسَنَ وَالْجِلْدَ الْحَسَنَ وَالْمَالَ بَعِيرًا أَتَبَلَّغُ عَلَيْهِ فِى سَفَرِى. فَقَالَ لَهُ إِنَّ الْحُقُوقَ كَثِيرَةٌ. فَقَالَ لَهُ كَأَنِّى أَعْرِفُكَ، أَلَمْ تَكُنْ أَبْرَصَ يَقْذَرُكَ النَّاسُ فَقِيرًا فَأَعْطَاكَ اللَّهُ فَقَالَ لَقَدْ وَرِثْتُ لِكَابِرٍ عَنْ كَابِرٍ. فَقَالَ إِنْ كُنْتَ كَاذِبًا فَصَيَّرَكَ اللَّهُ إِلَى مَا كُنْتَ، وَأَتَى الأَقْرَعَ فِى صُورَتِهِ وَهَيْئَتِهِ ، فَقَالَ لَهُ مِثْلَ مَا قَالَ لِهَذَا، فَرَدَّ عَلَيْهِ مِثْلَ مَا رَدَّ عَلَيْهِ هَذَا فَقَالَ إِنْ كُنْتَ كَاذِبًا فَصَيَّرَكَ اللَّهُ إِلَى مَا كُنْتَ. وَأَتَى الأَعْمَى فِى صُورَتِهِ فَقَالَ رَجُلٌ مِسْكِينٌ وَابْنُ سَبِيلٍ وَتَقَطَّعَتْ بِىَ الْحِبَالُ فِى سَفَرِى، فَلاَ بَلاَغَ الْيَوْمَ إِلاَّ بِاللَّهِ، ثُمَّ بِكَ أَسْأَلُكَ بِالَّذِى رَدَّ عَلَيْكَ بَصَرَكَ شَاةً أَتَبَلَّغُ بِهَا فِى سَفَرِى. فَقَالَ قَدْ كُنْتُ أَعْمَى فَرَدَّ اللَّهُ بَصَرِى، وَفَقِيرًا فَقَدْ أَغْنَانِى، فَخُذْ مَا شِئْتَ، فَوَاللَّهِ لاَ أَجْهَدُكَ الْيَوْمَ بِشَىْءٍ أَخَذْتَهُ لِلَّهِ. فَقَالَ أَمْسِكْ مَالَكَ، فَإِنَّمَا ابْتُلِيتُمْ، فَقَدْ رَضِىَ اللَّهُ عَنْكَ وَسَخِطَ عَلَى صَاحِبَيْكَ». [رواه البخاري: ٣٤٦٤]

**1444.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "(Vaxtı ilə) Allah İsrail oğullarından üç nəfəri – cüzam xəstəliyinə tutulmuş birisini, keçəli və kor adamı imtahana çəkmək istədi. Odur ki, onların yanına bir mələk göndərdi. Mələk (insan qiyafəsində əvvəlcə) cüzam xəstəliyinə tutulmuş kimsənin yanına gəlib dedi: "Sənin ən çox istədiyin şey nədir?" O dedi: "Gözəl rəng və gözəl dəri! İnsanlar artıq məndən diksinirlər." Mələk əlini onun vücuduna sürtdü və bu çirkinlik keçib getdi, onun rəngi və dərisi gözəlləşdi. Mələk soruşdu: "Sənin ən çox sevdiyin mal nədir?" O: "Dəvə ya da inəkdir[1]"– deyə cavab verdi. Ona on aylıq boğaz dəvə verildi və mələk dua edib dedi: "(Allah) bunu sənin üçün bərəkətli etsin!"

Sonra mələk keçəlin yanına gəlib dedi: "Sənin ən çox istədiyin şey nədir?" O dedi: "Gözəl saçım (olsun) və bu (keçəllik) məndən getsin. İnsanlar artıq məndən diksinirlər." Mələk əlini onun başına çəkdi və onun keçəlliyi keçib getdi, ona gözəl saç bəxş edildi. Mələk soruşdu: "Sənin ən çox sevdiyin mal nədir?" O: "İnəkdir"– dedi. Ona boğaz inək verildi və mələk dua edib dedi: "(Allah) bunu sənin üçün bərəkətli etsin!"

Bundan Sonra mələk korun yanına gəlib dedi: "Sənin ən çox istədiyin şey nədir?" O dedi: "Allah gözlərimi özümə qaytarsın və mən insanları görə bilim." Mələk əlini (onun gözlərinə sürtdü) və Allah onun gözlərini özünə qaytardı. Mələk soruşdu: "Sənin ən çox sevdiyin mal nədir?" O: "Qoyundur"– dedi. Ona balalı bir qoyun verildi (və mələk dua edib dedi: "Allah bunu sənin üçün bərəkətli etsin!)"

Bundan sonra bu ikisinin[2] heyvanları bala verdi, üçüncüsünün də (qoyunu) balaladı. Bir müddət keçdikdən sonra birinin bir vadi dolusu dəvəsi, o birinin bir vadi dolusu mal-qarası, üçüncüsünün də bir vadi dolusu qoyunu oldu. Sonra mələk ilk dəfə gəldiyi görkəmdə və qiyafədə cüzam xəstəliyinə tutulmuş kimsənin yanına gəlib dedi: "Mən kasıb bir adamam. Səfərdə ikən mənim bütün vəsaitim tükənmişdir. Bu gün mən yalnız və yalnız Allahın köməyi ilə, sonra da sənin köməyinlə (istəyimə) nail ola bilərəm. Sənə gözəl rəng, gözəl dəri və (bu qədər) sərvət bəxş etmiş Allah rizasına mənə bir dəvə ver, onun sayəsində səfərimi başa çatdıra bilim." (Bu adam cavabında ona) dedi: "Düzü, (özümün) o qədər verəcəyim var ki!" (Mələk) ona dedi: "Gərək ki, mən səni tanıyıram. Məgər sən həm cüzam xəstəliyinə tutulmuş, həm insanların diksindiyi, həm də kasıb bir adam deyildinmi? Sonra da Allah sənə (istədiklərini) vermədimi?" Adam dedi: "(Bu var-dövlət) mənə ata-babalarımdan miras qalmışdır." Mələk dedi: "Əgər yalan danışırsansa, Allah səni əvvəlki halına qaytarsın!" Sonra mələk ilk dəfə gəldiyi görkəmdə və qiyafədə keçəlin yanına gəldi və ona da əvvəlkinə dediklərinin eynisini söylədi. Əvvəlki adam ona rədd etdiyi kimi keçəl də ona yox cavabı verdi. (Onda Mələk) dedi: "Əgər yalan danışırsansa, Allah səni əvvəlki halına qaytarsın!" Sonra mələk ilk dəfə gəldiyi görkəmdə və qiyafədə korun yanına gəlib dedi: "Mən kasıb adamam, yolda qalmışam. Səfərdə ikən mənim bütün vəsaitim tükənmişdir. Bu gün mən ancaq və ancaq Allahın köməyi ilə, sonra da sənin köməyinlə (istəyimə) nail ola bilərəm. Sənin gözlərini özünə qaytaran Allah

[1] Hədisi nəql etmiş İshaq ibn Abdullah tərəddüd edərək cüzam xəstəliyinə tutulmuş kimsənin və keçəlin – ikisindən birinin dəvə, digərinin isə inək istədiyini iki cür rəvayət etmişdir.

[2] Dəvə və inək verilmiş o iki kimsənin.

rizasına mənə bir qoyun ver, onun sayəsində səfərimi başa çatdıra bilim." Adam dedi: "(Doğrudur,) mən kor idim, Allah gözlərimi mənə qaytardı, kasıb idim, O mənə var-dövlət nəsib etdi! Odur ki, nə qədər (qoyun) istəyirsənsə, götür. Vallahi ki, bu gün mən sənin Allah rizası üçün götürdüyün şeylərə hədd qoymayacağam." Mələk dedi: "Malını özünə saxla. Bu sizin üçün yalnız bir imtahan idi. Allah səndən razı qaldı, lakin o biri iki dostuna qəzəbi tutdu!" (əl-Buxari, 3464)

## 20-ci fəsil

## ٢٠– باب

١٤٤٥ – عَنْ أَبِى سَعِيدٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «كَانَ فِى بَنِى إِسْرَائِيلَ رَجُلٌ قَتَلَ تِسْعَةً وَتِسْعِينَ إِنْسَانًا ثُمَّ خَرَجَ يَسْأَلُ، فَأَتَى رَاهِبًا فَسَأَلَهُ، فَقَالَ لَهُ هَلْ مِنْ تَوْبَةٍ قَالَ لاَ. فَقَتَلَهُ ، فَجَعَلَ يَسْأَلُ، فَقَالَ لَهُ رَجُلٌ ائْتِ قَرْيَةَ كَذَا وَكَذَا. فَأَدْرَكَهُ الْمَوْتُ فَنَاءَ بِصَدْرِهِ نَحْوَهَا، فَاخْتَصَمَتْ فِيهِ مَلاَئِكَةُ الرَّحْمَةِ وَمَلاَئِكَةُ الْعَذَابِ، فَأَوْحَى اللَّهُ إِلَى هَذِهِ أَنْ تَقَرَّبِى. وَأَوْحَى اللَّهُ إِلَى هَذِهِ أَنْ تَبَاعَدِى. وَقَالَ قِيسُوا مَا بَيْنَهُمَا. فَوُجِدَ إِلَى هَذِهِ أَقْرَبُ بِشِبْرٍ، فَغُفِرَ لَهُ». [رواه البخاري: ٣٤٧٠]

**1445.** Əbu Səid ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İsrail oğullarından biri doxsan doqquz adam öldürmüşdü. Bundan sonra o, bir rahibin yanına gəlib (günahını etiraf etdi) və ondan: "Tövbə (etsəm, qəbul) olarmı?"- deyə soruşdu. Rahib: "Xeyr!"- dedikdə bu adam onu da öldürdü. Sonra o, (sualına cavab tapmaq üçün) soruşmağına davam etdi. (Axırda elmli) bir adam ona: "Get filan kəndə!"- dedi. Yolda ölüm onu haqladı və o, ölərkən sinəsini həmin kəndə doğru çevirdi. Bu vaxt rəhmət mələkləri ilə əzab mələkləri ona görə öz aralarında çəkişməyə başladılar. Allah yerin bu tərəfinə: "Yaxınlaş!", o tərəfinə[1] isə: "Uzaqlaş"- deyə vəhy etdi. Sonra da (mələklərə): "Bunların[2] arasındakı məsafəni ölçün!"- deyə buyurdu. (Məsafə ölçüldükdən sonra) bu adamın o kəndə bir qarış daha yaxın olduğu bəlli oldu və (Allah) onu bağışladı." (əl-Buxari, 3470)

١٤٤٦ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «اشْتَرَى رَجُلٌ مِنْ رَجُلٍ عَقَارًا لَهُ، فَوَجَدَ الرَّجُلُ الَّذِى اشْتَرَى الْعَقَارَ فِى عَقَارِهِ جَرَّةً فِيهَا ذَهَبٌ، فَقَالَ لَهُ الَّذِى اشْتَرَى الْعَقَارَ خُذْ ذَهَبَكَ مِنِّى، إِنَّمَا اشْتَرَيْتُ مِنْكَ الأَرْضَ، وَلَمْ أَبْتَعْ مِنْكَ الذَّهَبَ. وَقَالَ الَّذِى لَهُ الأَرْضُ إِنَّمَا بِعْتُكَ الأَرْضَ وَمَا فِيهَا، فَتَحَاكَمَا إِلَى رَجُلٍ، فَقَالَ الَّذِى تَحَاكَمَا إِلَيْهِ أَلَكُمَا وَلَدٌ قَالَ أَحَدُهُمَا لِى غُلاَمٌ. وَقَالَ الآخَرُ لِى جَارِيَةٌ. قَالَ أَنْكِحُوا الْغُلاَمَ الْجَارِيَةَ، وَأَنْفِقُوا عَلَى أَنْفُسِهِمَا مِنْهُ، وَتَصَدَّقَا». [رواه البخاري: ٣٤٧٢]

**1446.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bir dəfə) bir nəfər başqa birisindən onun malikanəsini satın aldı. Sonra malikanəni satın alan adam oradan bir küp qızıl tapdı və mülk sahibinə dedi: "Gəl qızıllarını apar! Mən səndən ancaq torpaq sahəsini satın almışam, qızılı ki, almamışam." Mülk yiyəsi dedi: "Mən onu sənə içindəkilərlə birlikdə satmışam." Belə olduqda onlar öz mübahisələrini həll etmək üçün (şəriəti bilən) bir adama müraciət

[1] Hədisdə "bu tərəf" deyildikdə onun getdiyi kənd – əməlisaleh insanların yaşadığı yer, "o tərəf" deyildikdə isə yaşadığı və günah işlətdiyi yer nəzərdə tutulur.

[2] Burada onun əməlisaleh insanların yaşadığı kənddən və günah işlətdiyi diyarından hansı birinə daha yaxın olduğunu ölçmək qəsd edilir.

etdilər və həmin adam soruşdu: "Sizin övladınız varmı?" Onlardan biri: "Mənim bir oğlum var!"- dedi. O birisi isə: "Mənim bir qızım var!"- dedi. Onda həmin adam belə buyurdu: "Oğlanla qızı evləndirin və bu qızılların (bir qismini) cavanlara xərcləyin, (bir qismini də) sədəqə verin!" (əl-Buxari, 3472)

١٤٤٧ – عَنْ سَعْد بْنِ أَبِى وَقَّاصٍ أَنَّهُ قَالَ لأُسَامَةَ بْنَ زَيْد: مَاذَا سَمِعْتَ مِنْ رَسُول اللَّه ﷺ فى الطَّاعُون فَقَالَ أُسَامَةُ: قَالَ رَسُولُ اللَّه ﷺ: «الطَّاعُونُ رِجْسٌ أُرْسِلَ عَلَى طَائفَة منْ بَنى إِسْرَائِيلَ أَوْ عَلَى مَنْ كَانَ قَبْلَكُمْ، فَإِذَا سَمِعْتُمْ بِه بِأَرْضٍ فَلاَ تَقْدَمُوا عَلَيْه، وَإِذَا وَقَعَ بِأَرْضٍ وَأَنْتُمْ بِهَا فَلاَ تَخْرُجُوا فِرَارًا مِنْهُ». [رواه البخاري: ٣٤٧٣]

**1447.** Rəvayət edilir ki, (bir dəfə) Səd ibn Əbu Vəqqas ﷺ Usamə ibn Zeyddən ﷺ: "Sən Peyğəmbərdən ﷺ taun (xəstəliyi) barəsində nə eşitmisən?"- deyə soruşdu." Usamə dedi: "Peyğəmbər ﷺ belə buyurmuşdur: "Taun murdar bir şeydir. Vaxtı ilə bu (xəstəlik) İsrail oğullarına və ya sizdən əvvəl yaşamış insanlara göndərilmişdi. Belə bir xəstəlik harada olursa-olsun, o yerə getməyin. Əgər bu xəstəlik siz olduğunuz yerdə yayılarsa, ondan qaçıb (canınızı qurtarmaq məqsədilə) oranı tərk etməyin." (əl-Buxari, 3473)

١٤٤٨ – عَنْ عَائشَةَ ﷺ زَوْجِ النَّبِيِّ ﷺ قَالَتْ: سَأَلْتُ رَسُولَ اللَّه ﷺ عَنِ الطَّاعُون، فَأَخْبَرَنِى: «أَنَّهُ عَذَابٌ يَبْعَثُهُ اللَّهُ عَلَى مَنْ يَشَاءُ، وَأَنَّ اللَّهَ جَعَلَهُ رَحْمَةً لِلْمُؤْمِنِينَ، لَيْسَ مِنْ أَحَد يَقَعُ الطَّاعُونُ فَيَمْكُثُ فِى بَلَده صَابِرًا مُحْتَسِبًا، يَعْلَمُ أَنَّهُ لاَ يُصِيبُهُ إِلاَّ مَا كَتَبَ اللَّهُ لَهُ، إِلاَّ كَانَ لَهُ مِثْلُ أَجْرِ شَهِيد». [رواه البخاري: ٣٤٧٤]

**1448.** Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Aişə ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərdən ﷺ taun barəsində soruşdum. O mənə dedi: "Bu bir əzabdır, Allah onu istədiyinə göndərir. (Bununla belə) Allah onu möminlər üçün bir mərhəmət etmişdir. Belə ki, yaşadığı məmləkətdə taun yayılmış bir adam səbir edərək və savabını (Allahdan) diləyərək, üstəlik bu xəstəliyin ona yalnız Allahın qəzavü-qədəri ilə yoluxa biləcəyinə etiqad edərək o yerdə qalarsa, ona şəhidin savabı qədər savab yazılar." (əl-Buxari, 3474)

١٤٤٩ – عَنْ عَبْد اللَّه بْنِ مَسْعُود ﷺ قَالَ: كَأَنِّى أَنْظُرُ إِلَى النَّبِيِّ ﷺ يَحْكِى نَبِيًّا مِنَ الأَنْبِيَاءِ ضَرَبَهُ قَوْمُهُ فَأَدْمَوْهُ، وَهُوَ يَمْسَحُ الدَّمَ عَنْ وَجْهِه، وَيَقُولُ: «اللَّهُمَّ اغْفِرْ لِقَوْمِى فَإِنَّهُمْ لاَ يَعْلَمُونَ». [رواه البخاري: ٣٤٧٧]

**1449.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Mən sanki Peyğəmbərin ﷺ peyğəmbərlərdən birinin başına gələn hadisəni danışdığını görürəm. Həmqəbilələri onu döyüb al-qana boyamış, o isə qanı üzündən silə-silə (dua edib) demişdir: "Allahım, mənim həmqəbilələrimi bağışla, çünki onlar (haqqı) bilmirlər!" (əl-Buxari, 3477)

١٤٥٠ – عَنْ ابْنَ عُمَرَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «بَيْنَمَا رَجُلٌ يَجُرُّ إِزَارَهُ مِنَ الْخُيَلاَءِ خُسِفَ بِه، فَهْوَ يَتَجَلْجَلُ فِى الأَرْضِ إِلَى يَوْمِ الْقِيَامَةِ». [رواه البخاري: ٣٤٨٥]

**1450.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir nəfər təkəbbürlüyündən izarının[1] ətəyini yerlə sürüyərkən qəfildən yerə girdi. Bu adam Qiyamət gününədək yerin (ən aşağı) təbəqəsinə doğru girməyə davam edəcəkdir." (əl-Buxari, 3485)

[1] 239-cu hədisin qeydlərinə bax.

# ٦١ – كِتَابُ المَنَاقِبِ

# 61 – Tərifəlayiq xüsusiyyətlər kitabı

## ١ – باب: المَنَاقِبُ

## 1-ci fəsil. Tərifəlayiq xüsusiyyətlər

١٤٥١ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: «تَجِدُونَ النَّاسَ مَعَادِنَ، خِيَارُهُمْ فِى الْجَاهِلِيَّةِ خِيَارُهُمْ فِى الإِسْلاَمِ إِذَا فَقِهُوا، وَتَجِدُونَ خَيْرَ النَّاسِ فِى هَذَا الشَّأْنِ أَشَدَّهُمْ لَهُ كَرَاهِيَةً»، «وَتَجِدُونَ شَرَّ النَّاسِ ذَا الْوَجْهَيْنِ، الَّذِى يَأْتِى هَؤُلاَءِ بِوَجْهٍ، وَيَأْتِى هَؤُلاَءِ بِوَجْهٍ». [رواه البخاري: ٣٤٩٣-٣٤٩٤]

**1451.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Siz, insanların mədənlər[1] kimi olduğunu görəcəksiniz. Cahiliyyət dövründə onların xeyirli olanları, – əgər şəriəti başa düşsələr, – İslamda da xeyirli olarlar. Bu xüsusda insanların ən xeyirlilərinin buna[2] ən çox nifrət edənlər olduğunu görəcəksiniz. İnsanların ən pisinin isə bir topluma bir sifətlə, o biri topluma başqa bir sifətlə yaxınlaşan ikiüzlülər olduğunu görəcəksiniz". (əl-Buxari, 3493-3494)

١٤٥٢ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ النَّبِىَّ ﷺ قَالَ: «النَّاسُ تَبَعٌ لِقُرَيْشٍ فِى هَذَا الشَّأْنِ، مُسْلِمُهُمْ تَبَعٌ لِمُسْلِمِهِمْ، وَكَافِرُهُمْ تَبَعٌ لِكَافِرِهِمْ »، «وَالنَّاسُ مَعَادِنُ، خِيَارُهُمْ فِى الْجَاهِلِيَّةِ خِيَارُهُمْ فِى الإِسْلاَمِ إِذَا فَقِهُوا، تَجِدُونَ مِنْ خَيْرِ النَّاسِ أَشَدَّ النَّاسِ كَرَاهِيَةً لِهَذَا الشَّأْنِ حَتَّى يَقَعَ فِيهِ». [رواه البخاري: ٣٤٩٥-٣٤٩٦]

**1452.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bu xüsusda[3] insanlar qureyşə tabedirlər. Müsəlman olanları müsəlman olanlarına, kafir olanları da kafir olanlarına tabedirlər. İnsanlar mədən kimidirlər. Cahiliyyət dövründə onların xeyirli olanları, – əgər şəriəti başa düşsələr, – İslamda da xeyirli olarlar. Bu xüsusda insanların ən xeyirlisi özünə (hakimiyyət) təklif edilənədək buna ən çox nifrət edən kimsələrdir." (əl-Buxari, 3495-3496)

## ٢ – باب: مَنَاقِبُ قُرَيْشٍ

## 2-ci fəsil. Qureyşlilərin tərifəlayiq xüsusiyyətləri

١٤٥٣ – عَنْ مُعَاوِيَةَ ﷺ وَقَدْ بَلَغَهُ أَنَّ عَبْدَ اللَّهِ بْنَ عَمْرِو بْنِ الْعَاصِ يُحَدِّثُ أَنَّهُ سَيَكُونُ مَلِكٌ مِنْ قَحْطَانَ، فَغَضِبَ مُعَاوِيَةُ، فَقَامَ فَأَثْنَى عَلَى اللَّهِ بِمَا هُوَ أَهْلُهُ، ثُمَّ قَالَ أَمَّا بَعْدُ فَإِنَّهُ بَلَغَنِى أَنَّ رِجَالاً مِنْكُمْ يَتَحَدَّثُونَ أَحَادِيثَ لَيْسَتْ فِى كِتَابِ اللَّهِ، وَلاَ تُؤْثَرُ عَنْ رَسُولِ اللَّهِ ﷺ، فَأُولَئِكَ جُهَّالُكُمْ ، فَإِيَّاكُمْ وَالأَمَانِىَّ الَّتِى تُضِلُّ أَهْلَهَا، فَإِنِّى سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «إِنَّ هَذَا الأَمْرَ فِى قُرَيْشٍ، لاَ يُعَادِيهِمْ أَحَدٌ إِلاَّ كَبَّهُ اللَّهُ عَلَى وَجْهِهِ، مَا أَقَامُوا الدِّينَ». [رواه البخاري: ٣٥٠٠]

---

[1] Belə ki, mədəndən faydalı qazıntılar çıxdığı kimi, zərərlisi də çıxa bilər.
[2] Yəni hakimiyyətə can atmağa.
[3] Yəni hakimiyyətə gəlmək.

**1453.** Rəvayət edilir ki, (bir dəfə) Müaviyəyə ﷺ Abdullah ibn Amr ibn əl-Asın "Qəhtan qəbiləsindən bir hökmdar olacaq"- dediyi xəbər verildikdə Müaviyə qəzəbləndi. O ayağa qalxıb Allaha – Ona layiq tərzdə təriflər dedikdən sonra buyurdu: "Sonra isə... Mənə xəbər verilmişdir ki, sizlərdən bəziləri Allahın Kitabında olmayan və Onun peyğəmbərindən ﷺ rəvayət edilməyən sözləri danışırlar. Onlar sizin cahillərinizdir. Odur ki, insanları yoldan çıxardan ümidlərə qapılmaqdan çəkinin! Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Bu (idarəçilik) işi qureyşlilərin arasında qalacaq. Onlar bu dini yaşadacaqları müddət ərzində kim onlara qarşı çıxsa, Allah onu zəlil edər. " (əl-Buxari, 3500)

**١٤٥٤** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «قُرَيْشٌ وَالأَنْصَارُ وَجُهَيْنَةُ وَمُزَيْنَةُ وَأَسْلَمُ وَأَشْجَعُ وَغِفَارُ مَوَالِيَّ لَيْسَ لَهُمْ مَوْلًى، دُونَ اللَّهِ وَرَسُولِهِ». [رواه البخاري: ٣٥٠٤]

**1454.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qureyşlilər, ənsar, cuheynəlilər, muzeynəlilər, əsləmlilər, əşcəilər və ğifarlılar mənim ən yaxın köməkçilərimdir. Onların da Allahdan və Onun elçisindən başqa bir köməkçiləri yoxdur." (əl-Buxari, 3504)

**١٤٥٥** – عَنْ ابْنِ عُمَرَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لا يَزَالُ هَذَا الأَمْرُ فِي قُرَيْشٍ، مَا بَقِيَ مِنْهُمُ اثْنَانِ». [رواه البخاري: ٣٥٠١]

**1455.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qureyşlilərdən cəmi iki nəfər qalmış olsa belə, bu (idarəçilik) işi onların arasında davam edəcəkdir." (əl-Buxari, 3501)

**١٤٥٦** – عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ﷺ قَالَ: مَشَيْتُ أَنَا وَعُثْمَانُ بْنُ عَفَّانَ ﷺ، فَقَالَ يَا رَسُولَ اللَّهِ أَعْطَيْتَ بَنِي الْمُطَّلِبِ وَتَرَكْتَنَا، وَإِنَّمَا نَحْنُ وَهُمْ مِنْكَ بِمَنْزِلَةٍ وَاحِدَةٍ. فَقَالَ النَّبِيُّ ﷺ: «إِنَّمَا بَنُو هَاشِمٍ وَبَنُو الْمُطَّلِبِ شَيْءٌ وَاحِدٌ». [رواه البخاري: ٣٥٠٢]

**1456.** Rəvayət edilir ki, Cubeyr ibn Mutim ﷺ demişdir: "(Bir dəfə) mən Osman ibn Əffanla birlikdə Peyğəmbərin ﷺ yanına getdim və (Osman) dedi: "Ya Rəsulullah, nə üçün sən Muttəlib oğullarına (pay) ayırdın, bizə isə heç nə vermədin. Halbuki biz də, onlar kimi sənə yaxınıq." Peyğəmbər ﷺ buyurdu: "Fəqət Haşim və Muttəlib oğulları eynidirlər." (əl-Buxari, 3502)

## 3-cü fəsil

## ٣– باب

**١٤٥٧** – عَنْ أَبِي ذَرٍّ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ: «لَيْسَ مِنْ رَجُلٍ ادَّعَى لِغَيْرِ أَبِيهِ وَهُوَ يَعْلَمُهُ إِلاَّ كَفَرَ، وَمَنِ ادَّعَى قَوْمًا لَيْسَ لَهُ فِيهِمْ فَلْيَتَبَوَّأْ مَقْعَدَهُ مِنَ النَّارِ». [رواه البخاري: ٣٥٠٨]

**1457.** Rəvayət edilir ki, Əbu Zərr ﷺ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Kim bilərəkdən doğma atasının deyil, başqa birisinin oğlu olduğunu iddia edərsə, küfr etmiş olar. Kim özünün heç bir qohumluq əlaqəsi olmadığı bir qəbiləyə mənsub olduğunu iddia edərsə, qoy Cəhənnəmdəki yerini tutsun." (əl-Buxari, 3508)

١٤٥٨ – عَنْ وَاثِلَةَ بْنِ الأَسْقَعِ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّ مِنْ أَعْظَمِ الْفِرَى أَنْ يَدَّعِيَ الرَّجُلُ إِلَى غَيْرِ أَبِيهِ، أَوْ يُرِيَ عَيْنَهُ مَا لَمْ تَرَ، أَوْ يَقُولُ عَلَى رَسُولِ اللَّهِ ﷺ مَا لَمْ يَقُلْ». [رواه البخاري: ٣٥٠٩]

**1458.** Vasilə ibn Əsqa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ən böyük iftira, adamın doğma atasına yox, başqa birisinə mənsub olduğunu iddia etməsi, habelə (yuxuda) görmədiyi bir şeyi gördüyünü danışması və Peyğəmbərin ﷺ demədiyi bir sözü onun adından rəvayət etməsidir." (əl-Buxari, 3509)

## ٤ – باب: ذِكْرُ أَسْلَمَ وَغِفَارَ وَمُزَيْنَةَ وَجُهَيْنَةَ وَأَشْجَعَ

## 4-cü fəsil. Əsləm, Ğifar, Muzeynə, Cuheynə və Əşcə (qəbilələri) haqqında (deyilənlər)

١٤٥٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ عَلَى الْمِنْبَرِ: «غِفَارُ غَفَرَ اللَّهُ لَهَا، وَأَسْلَمُ سَالَمَهَا اللَّهُ، وَعُصَيَّةُ عَصَتِ اللَّهَ وَرَسُولَهُ». [رواه البخاري: ٣٥١٣]

**1459.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ minbərdə (xütbə verərkən) demişdir: "Allah Ğifar qəbiləsini bağışlasın! Allah Əsləm qəbiləsinə əmin-amanlıq nəsib etsin! Üseyyə qəbiləsi isə Allaha və Onun rəsuluna asi olmuşdur." (əl-Buxari, 3513)

١٤٦٠ – عَنْ أَبِي بَكْرَةَ ﷺ أَنَّ الأَقْرَعَ بْنَ حَابِسٍ قَالَ لِلنَّبِيِّ ﷺ إِنَّمَا بَايَعَكَ سُرَّاقُ الْحَجِيجِ مِنْ أَسْلَمَ وَغِفَارَ وَمُزَيْنَةَ قَالَ النَّبِيُّ ﷺ: «أَرَأَيْتَ إِنْ كَانَ أَسْلَمُ وَغِفَارُ وَمُزَيْنَةُ – وَأَحْسِبُهُ – وَجُهَيْنَةُ خَيْرًا مِنْ بَنِي تَمِيمٍ وَبَنِي عَامِرٍ وَأَسَدٍ وَغَطَفَانَ، خَابُوا وَخَسِرُوا». قَالَ نَعَمْ. قَالَ: «وَالَّذِي نَفْسِي بِيَدِهِ، إِنَّهُمْ لَخَيْرٌ مِنْهُمْ». [رواه البخاري: ٣٥١٦]

**1460.** Əbu Bəkrə ﷺ rəvayət etmişdir ki, (bir dəfə) Əqra ibn Habis Peyğəmbərə ﷺ dedi: "Sənə ancaq Əsləm, Ğifar və Muzeynə qəbiləsindən olub hacıları soyub talayan oğrular beyət etmişlər." Peyğəmbər ﷺ dedi: "Yoxsa sən elə güman edirsən ki, Əsləm, Ğifar, Muzeynə və Cuheynə qəbilələri, Bəni-Təmim, Bəni-Amir, Əsəd və Ğətəfan qəbilələrindən xeyirli olduğu halda onlar naümid qalmış və ziyana uğramışlar?" O: "Bəli!"– dedi. Peyğəmbər ﷺ buyurdu: "Canım Əlində olan Allaha and olsun ki, onlar bunlardan daha xeyirlidirlər." (əl-Buxari, 3516)

١٤٦١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ، قَالَ النَّبِيُّ ﷺ: أَسْلَمُ وَغِفَارُ وَشَيْءٌ مِنْ مُزَيْنَةَ وَجُهَيْنَةَ – أَوْ قَالَ شَيْءٌ مِنْ جُهَيْنَةَ أَوْ مُزَيْنَةَ – خَيْرٌ عِنْدَ اللَّهِ – أَوْ قَالَ – يَوْمَ الْقِيَامَةِ مِنْ أَسَدٍ وَتَمِيمٍ وَهَوَازِنَ وَغَطَفَانَ. [رواه البخاري: ٣٥٢٣]

**1461.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əsləmlilər, ğifarlılar və bəzi muzeynəlilər və cuheynəlilər Allahın hüzurunda (və ya Qiyamət günü) Əsəd, Təmim, Həvazin və Ğətəfan qəbilələrindən daha xeyirli olacaqlar." (əl-Buxari, 3523)

## 5-ci fəsil. Qəhtan (qəbiləsi) haqqında (deyilənlər)

## ٥- باب: ذِكْرُ قَحْطَانَ

١٤٦٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لاَ تَقُومُ السَّاعَةُ حَتَّى يَخْرُجَ رَجُلٌ مِنْ قَحْطَانَ يَسُوقُ النَّاسَ بِعَصَاهُ». [رواه البخاري: ٣٥١٧]

**1462.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qəhtan qəbiləsindən bir nəfər çıxıb (əlindəki) əsası ilə insanları qovub aparmayınca Qiyamət qopmaz." (əl-Buxari, 3517)

## 6-cı fəsil. Cahiliyyət dövründə olduğu kimi (köməyə) çağırmağın qadağan olunması

## ٦- باب: مَا يُنْهَى مِنْ دَعْوَةِ الْجَاهِلِيَّةِ

١٤٦٣ – عَنْ جَابِرٍ ﷺ قَالَ: غَزَوْنَا مَعَ النَّبِيِّ ﷺ وَقَدْ ثَابَ مَعَهُ نَاسٌ مِنَ الْمُهَاجِرِينَ حَتَّى كَثُرُوا، وَكَانَ مِنَ الْمُهَاجِرِينَ رَجُلٌ لَعَّابٌ فَكَسَعَ أَنْصَارِيًّا، فَغَضِبَ الأَنْصَارِيُّ غَضَبًا شَدِيدًا، حَتَّى تَدَاعَوْا، وَقَالَ الأَنْصَارِيُّ يَا لَلأَنْصَارِ. وَقَالَ الْمُهَاجِرِيُّ يَا لَلْمُهَاجِرِينَ. فَخَرَجَ النَّبِيُّ ﷺ فَقَالَ: «مَا بَالُ دَعْوَى أَهْلِ الْجَاهِلِيَّةِ». ثُمَّ قَالَ: «مَا شَأْنُهُمْ». فَأُخْبِرَ بِكَسْعَةِ الْمُهَاجِرِيِّ الأَنْصَارِيَّ قَالَ: فَقَالَ النَّبِيُّ ﷺ: «دَعُوهَا فَإِنَّهَا خَبِيثَةٌ». وَقَالَ عَبْدُ اللَّهِ بْنُ أُبَيٍّ ابْنُ سَلُولَ أَقَدْ تَدَاعَوْا عَلَيْنَا، لَئِنْ رَجَعْنَا إِلَى الْمَدِينَةِ لَيُخْرِجَنَّ الأَعَزُّ مِنْهَا الأَذَلَّ. فَقَالَ عُمَرُ أَلاَ نَقْتُلُ يَا رَسُولَ اللَّهِ هَذَا الْخَبِيثَ لِعَبْدِ اللَّهِ. فَقَالَ النَّبِيُّ ﷺ: «لاَ، يَتَحَدَّثُ النَّاسُ أَنَّهُ كَانَ يَقْتُلُ أَصْحَابَهُ». [رواه البخاري: ٣٥١٨]

**1463.** Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə döyüşə çıxarkən mühacirlər onun başına yığışdılar və onların sayı getdikcə artmağa başladı. Bu mühacirlərin arasında mahir nizə oynadan (çox zarafatçıl) bir adam var idi. O (zarafatca) ənsardan birini vurdu. Ənsardan olan əshabə bərk qəzəbləndi və (iş o yerə gəlib çatdı ki,) onlardan hər biri (öz dostlarını) köməyə çağırmağa başladı. Ənsardan olan adam qışqırıb dedi: "Ey ənsar, (köməyə gəlin)!" Mühacir də qışqırıb dedi: "Ey mühacirlər, (köməyə gəlin)!" Bu vaxt Peyğəmbər ﷺ (öz çadırından) çıxıb dedi: "Bu nə cahillikdir (bunlar) edir? Onlara nə olub?" Mühacirin ənsardan olan kimsəni vurduğunu Peyğəmbərə ﷺ xəbər verdilər. Peyğəmbər ﷺ buyurdu: "Belə çağırışlardan əl çəkin! Bu pis bir şeydir." (Bunu eşidəndə) Abdullah ibn Ubey ibn Səlul[1] dedi: "Yoxsa onlar bir-birilərini bizim əleyhimizə çağırırdılar. Mədinəyə qayıdan kimi qüdrətli olanlar rəzil adamları oradan çıxardacaqlar." [2] Bu vaxt Ömər ﷺ dedi: "Bu yaramaz Abdullahı öldürməyəkmi, ya Rəsulullah?" Peyğəmbər ﷺ buyurdu: "Xeyr, (öldürməyin!) Yoxsa camaat deyəcək ki, (Muhəmməd) öz əshabələrini öldürür." (əl-Buxari, 3518)

---

[1] Bu adam münafiqlərin başçısı olmuşdur.
[2] Yəni ənsar mühacirləri oradan qovub çıxardacaqdır.

## ٧– باب: قِصَّةُ خُزَاعَةَ

## 7-ci fəsil. Xuzaə qəbiləsinin əhvalatı

١٤٦٤ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «عَمْرُو بْنُ لُحَىِّ بْنِ قَمَعَةَ بْنِ خِنْدِفَ أَبُو خُزَاعَةَ». [رواه البخاري: ٣٥٢٠]

**1464.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Amr ibn Luhey ibn Qəməa ibn Xindif, Xuzaənin atasıdır!" (əl-Buxari, 3520)

١٤٦٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «رَأَيْتُ عَمْرَو بْنَ عَامِرِ بْنِ لُحَىٍّ الْخُزَاعِىَّ يَجُرُّ قُصْبَهُ فِى النَّارِ، وَكَانَ أَوَّلَ مَنْ سَيَّبَ السَّوَائِبَ». [رواه البخاري: ٣٥٢١]

**1465.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən Amr ibn Amir ibn Luhey əl-Xuzaini Cəhənnəm odunda bağırsaqlarını (yerlə) sürüyərkən gördüm. (Çünki) saibələri[1] ilk dəfə o sərbəst buraxmışdır." (əl-Buxari, 3521)

## ٨– باب: قِصَّةُ إِسْلاَمِ أَبِى ذَرٍّ الْغِفَارِىِّ ﷺ

## 8-ci fəsil. Əbu Zərr əl-Ğifarinin ﷺ İslamı qəbul etməsi haqqında hekayə

١٤٦٦ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: قَالَ أَبُو ذَرٍّ ﷺ كُنْتُ رَجُلاً مِنْ غِفَارٍ، فَبَلَغَنَا أَنَّ رَجُلاً قَدْ خَرَجَ بِمَكَّةَ، يَزْعُمُ أَنَّهُ نَبِىٌّ، فَقُلْتُ لأَخِى انْطَلِقْ إِلَى هَذَا الرَّجُلِ كَلِّمْهُ وَأْتِنِى بِخَبَرِهِ. فَانْطَلَقَ فَلَقِيَهُ، ثُمَّ رَجَعَ فَقُلْتُ مَا عِنْدَكَ فَقَالَ وَاللَّهِ لَقَدْ رَأَيْتُ رَجُلاً يَأْمُرُ بِالْخَيْرِ وَيَنْهَى عَنِ الشَّرِّ. فَقُلْتُ لَهُ لَمْ تَشْفِنِى مِنَ الْخَبَرِ. فَأَخَذْتُ جِرَابًا وَعَصًا، ثُمَّ أَقْبَلْتُ إِلَى مَكَّةَ فَجَعَلْتُ لاَ أَعْرِفُهُ، وَأَكْرَهُ أَنْ أَسْأَلَ عَنْهُ، وَأَشْرَبُ مِنْ مَاءِ زَمْزَمَ وَأَكُونُ فِى الْمَسْجِدِ. قَالَ فَمَرَّ بِى عَلِىٌّ فَقَالَ كَأَنَّ الرَّجُلَ غَرِيبٌ. قَالَ قُلْتُ نَعَمْ. قَالَ فَانْطَلِقْ إِلَى الْمَنْزِلِ. قَالَ فَانْطَلَقْتُ مَعَهُ لاَ يَسْأَلُنِى عَنْ شَىْءٍ، وَلاَ أُخْبِرُهُ، فَلَمَّا أَصْبَحْتُ غَدَوْتُ إِلَى الْمَسْجِدِ لأَسْأَلَ عَنْهُ، وَلَيْسَ أَحَدٌ يُخْبِرُنِى عَنْهُ بِشَىْءٍ. قَالَ فَمَرَّ بِى عَلِىٌّ فَقَالَ أَمَا نَالَ لِلرَّجُلِ يَعْرِفُ مَنْزِلَهُ بَعْدُ قَالَ قُلْتُ لاَ. قَالَ انْطَلِقْ مَعِى. قَالَ فَقَالَ مَا أَمْرُكَ وَمَا أَقْدَمَكَ هَذِهِ الْبَلْدَةَ قَالَ قُلْتُ لَهُ إِنْ كَتَمْتَ عَلَىَّ أَخْبَرْتُكَ. قَالَ فَإِنِّى أَفْعَلُ. قَالَ قُلْتُ لَهُ بَلَغَنَا أَنَّهُ قَدْ خَرَجَ هَا هُنَا رَجُلٌ يَزْعُمُ أَنَّهُ نَبِىٌّ، فَأَرْسَلْتُ أَخِى لِيُكَلِّمَهُ فَرَجَعَ وَلَمْ يَشْفِنِى مِنَ الْخَبَرِ، فَأَرَدْتُ أَنْ أَلْقَاهُ. فَقَالَ لَهُ أَمَا إِنَّكَ قَدْ رَشَدْتَ، هَذَا وَجْهِى إِلَيْهِ، فَاتَّبِعْنِى، ادْخُلْ حَيْثُ أَدْخُلُ، فَإِنِّى إِنْ رَأَيْتُ أَحَدًا أَخَافُهُ عَلَيْكَ، قُمْتُ إِلَى الْحَائِطِ، كَأَنِّى أُصْلِحُ نَعْلِى، وَامْضِ أَنْتَ، فَمَضَى وَمَضَيْتُ مَعَهُ، حَتَّى دَخَلَ وَدَخَلْتُ مَعَهُ عَلَى النَّبِىِّ ﷺ فَقُلْتُ لَهُ اعْرِضْ عَلَىَّ الإِسْلاَمَ. فَعَرَضَهُ فَأَسْلَمْتُ مَكَانِى، فَقَالَ لِى: «يَا أَبَا ذَرٍّ اكْتُمْ هَذَا الأَمْرَ، وَارْجِعْ إِلَى بَلَدِكَ، فَإِذَا بَلَغَكَ ظُهُورُنَا فَأَقْبِلْ». فَقُلْتُ وَالَّذِى بَعَثَكَ بِالْحَقِّ لأَصْرُخَنَّ بِهَا بَيْنَ أَظْهُرِهِمْ. فَجَاءَ إِلَى الْمَسْجِدِ، وَقُرَيْشٌ فِيهِ فَقَالَ يَا مَعْشَرَ قُرَيْشٍ، إِنِّى أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ. فَقَالُوا قُومُوا إِلَى هَذَا الصَّابِئِ. فَقَامُوا فَضُرِبْتُ لأَمُوتَ فَأَدْرَكَنِى الْعَبَّاسُ، فَأَكَبَّ عَلَىَّ ثُمَّ أَقْبَلَ عَلَيْهِمْ، فَقَالَ وَيْلَكُمْ تَقْتُلُونَ رَجُلاً مِنْ غِفَارَ، وَمَتْجَرُكُمْ

---

[1] Ardıcıl olaraq on dişi dəvə balalayan və buna görə ərəb bütpərəstləri tərəfindən sitayiş edilən dişi dəvədir. Bütpərəstlər onu sərbəst buraxır, onu minmir, onunla yük daşımır, yununu qırxmır və südünü də ancaq qonağa verərdilər. Bu batil əqidənin əsasını isə Amr ibn Luhey əl-Xuzai qoymuşdur.

وَمَمَرُّكُمْ عَلَى غِفَارَ. فَأَقْلَعُوا عَنِّى، فَلَمَّا أَنْ أَصْبَحْتُ الْغَدَ رَجَعْتُ فَقُلْتُ مِثْلَ مَا قُلْتُ بِالأَمْسِ، فَقَالُوا قُومُوا إِلَى هَذَا الصَّابِئِ. فَصُنِعَ بِى مِثْلَ مَا صُنِعَ بِالأَمْسِ وَأَدْرَكَنِى الْعَبَّاسُ فَأَكَبَّ عَلَىَّ، وَقَالَ مِثْلَ مَقَالَتِهِ بِالأَمْسِ. قَالَ فَكَانَ هَذَا أَوَّلَ إِسْلاَمِ أَبِى ذَرٍّ رَحِمَهُ اللَّهُ. [رواه البخاري: ٣٥٢٢]

**1466.** İbn Abbas ﵄ rəvayət edir ki, Əbu Zərr demişdir: "Mən Ğifar qəbiləsindən idim. (İslamın ilk günlərində) bizə xəbər gəlib çatdı ki, Məkkədə bir adam peyda olub, peyğəmbər olduğunu iddia edir. Onda mən qardaşıma dedim: "Get o adamın yanına, onunla danış və mənə ondan bir xəbər gətir!" Qardaşım (Məkkəyə) gedib onunla görüşdü, sonra geri qayıtdı. Mən soruşdum: "Nə xəbər (gətirmisən)?" Dedi: "Vallahi, mən (insanlara) yaxşı işlər görməyi buyuran və (onları) pis işlərdən çəkindirən birisini gördüm." Mən (ona): "Sən mənə lazım olan xəbərləri gətirməmisən?"- dedim, sonra da bir cürdək su və bir əl ağacı götürüb Məkkəyə yola düşdüm. Mən (Peyğəmbəri ﷺ) tanımırdım və heç bir kimsədən onun haqqında soruşmaq da istəmirdim. Mən Zəm-zəm suyundan içirdim və Məscidülhəramda qalırdım. (Həmin vaxt) Əli gəlib mənim yanımdan keçdi və (mənə): "Qərib adama oxşayırsan"– dedi. Mən: "Bəli!"– dedim. O (mənə): "Elə isə gedək evə!"– dedi, mən də onunla getdim. O məndən bir söz soruşmadı, mən də ona heç nə demədim. Səhər açıldıqda mən (Peyğəmbəri ﷺ) soraqlamaq üçün məscidə gəldim, lakin heç kəs mənə onun haqqında bir söz demədi. (Yenə) Əli mənim yanımdam keçdi və soruşdu: "Sən (qonaq) qalmaq üçün hələ özünə bir yer tapa bilməmisən?" Dedim: "Xeyr!" Dedi: "Gedək mənimlə!" (Yolda) məndən soruşdu ki: "Sən nə gəzirsən? Bu şəhərə gəlməyinin səbəbi nədir?" Mən ona dedim: "Heç kimə deməyəcəksənsə, sənə (məqsədimi) bildirim." Əli: "Baş üstə!"– dedi. Mən ona dedim: "Bizə xəbər çatıb ki, Məkkədə bir adam peyda olub, peyğəmbər olduğunu iddia edir. Mən qardaşımı göndərmişdim ki, onunla danışsın (və onun barəsində mənə bir xəbər gətirsin), lakin o qayıdıb mənə lazımi xəbərləri çatdırmadı. Odur ki, mən özüm onunla görüşmək istədim. Əli dedi: "Sən düz yol tutmusan! İndi mən onun yanına gedəcəm, sən də mənim dalımca gələrsən. Mən hara girsəm, sən də ora girərsən. Əgər yolda sənə xətər toxundura biləcək birisini görsəm, dayanıb divarın dibinə çəkiləcəyəm ki, guya ayaqqabımın bağını bağlayıram. Sənsə yoluna davam edərsən." (Bunu deyəndən) sonra o getdi, mən də onun dalınca getdim. O gedib bir evə daxil oldu, mən də onun dalınca Peyğəmbərin ﷺ yanına daxil oldum və ona: "Mənə İslam haqqında danış!"- dedim. O mənə İslam dinini başa saldı və mən elə yerimdəcə bu dini qəbul etdim. Peyğəmbər ﷺ mənə dedi: "Ey Əbu Zərr, bunu heç kəsə bildirmə, qayıt öz qəbilənə. Elə ki bizim açıq-aydın dəvət etdiyimizi eşitdin, gəl qoşul (bizə)." Dedim: "Səni haqq ilə göndərən Allaha and olsun ki, mən bunu onların[1] arasında açıq-aydın elan edəcəyəm."

Bundan sonra Əbu Zərr məscidə gəldi. (Həmin vaxt) qureyşlilər orada idilər. (Əbu Zərr uca səslə) dedi: "Ey qureyşlilər! Mən şahidlik edirəm ki, Allahdan başqa məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir." Müşriklər (bir-birilərinə): "Qalxın bu sabiinin[2] dərsini verək!"– dedilər.

---

[1] Yəni müşriklərin arasında.

[2] 227-ci hədisin qeydlərinə bax.

(Əbu Zərr) dedi: “Onlar qalxıb məni o ki var döydülər. Bu vaxt Abbas sinəsini qabağa verib məni müdafiə etdi və üzünü onlara tutub dedi: “Vay sizin halınıza! Siz Ğifar qəbiləsindən olan bir adamı öldürmək istəyirsiniz? Halbuki sizin həm ticarət yollarınız, həm də özünüzün gediş-gəlişiniz oradan keçir.” (Bunu eşidəndə) onlar məndən əl çəkdilər. Səhəri gün mən onların yanına qayıdıb dünən dediklərimi təkrar etdim. Onlar (yenə): “Qalxın bu sabiinin dərsini verək!”– dedilər və məni dünənki kökə saldılar. Yenə Abbas sinəsini qabağa verib məni müdafiə etdi və dünən dediklərini bir daha təkrar etdi.”

Beləcə, Əbu Zərr İslam dinini qəbul etdi, Allah ona rəhmət eləsin!” (əl-Buxari, 3522)

## ٩– باب: مَنِ انْتَسَبَ إِلَى آبَائِهِ فِي الإِسْلاَمِ وَالْجَاهِلِيَّةِ

## 9-cu fəsil. Həm İslamda, həm də cahiliyyət dövründə özünü ata-babalarına aid edən kimsə haqqında

١٤٦٧ – عَنْ ابْنِ عَبَّاسٍ ﭬ قَالَ: لَمَّا نَزَلَتْ ﴿وَأَنذِرْ عَشِيرَتَكَ ٱلْأَقْرَبِينَ﴾ جَعَلَ النَّبِيُّ ﷺ يُنَادِي: «يَا بَنِي فِهْرٍ، يَا بَنِي عَدِيٍّ لِبُطُونِ قُرَيْشٍ». [رواه البخاري: ٣٥٢٥]

**1467.** Rəvayət edilir ki, ibn Abbas ﭬ demişdir: “(Allahın) “Ən yaxın qohumlarını qorxut!”[1] ayəsi nazil olduqda Peyğəmbər ﷺ uca səslə: “Ey Fəhr oğulları! Adiy oğulları!...”– deyib qureyşlilərin ayrı-ayrı nəsillərini çağırmağa başladı.” (əl-Buxari, 3525)

## ١٠– باب: مَنْ أَحَبَّ أَنْ لاَ يُسَبَّ نَسَبُهُ

## 10-cu fəsil. Əsil-nəsəbinin təhqir olunmağını istəməyən kimsə haqqında

١٤٦٨ – عَنْ عَائِشَةَ ﭫ قَالَت: اسْتَأْذَنَ حَسَّانُ النَّبِيَّ ﷺ فِي هِجَاءِ الْمُشْرِكِينَ، قَالَ: «كَيْفَ بِنَسَبِي». فَقَالَ حَسَّانُ لأَسُلَّنَّكَ مِنْهُمْ كَمَا تُسَلُّ الشَّعَرَةُ مِنَ الْعَجِينِ. [رواه البخاري: ٣٥٣١]

**1468.** Rəvayət edilir ki, Aişə ﭫ demişdir: “Həssan (öz şeiri ilə) müşrikləri gülünc vəziyyətdə qoymaqla yerinə oturtmaq üçün Peyğəmbərdən ﷺ izn istədi. Peyğəmbər ﷺ soruşdu: “Bəs mənim əsil-nəsəbim necə olacaq?” Həssan dedi: “Tük xəmirin içindən çıxarıldığı kimi, mən səni onların arasından çıxaracağam.[2]” (əl-Buxari, 3531)

## ١١– باب: مَا جَاءَ فِي أَسْمَاءِ رَسُولِ اللَّهِ ﷺ

## 11-ci fəsil. Peyğəmbərin ﷺ adları barədə varid olan (rəvayətlər)

١٤٦٩ – عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ﭬ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «لِي خَمْسَةُ أَسْمَاءٍ أَنَا مُحَمَّدٌ، وَأَحْمَدُ، وَأَنَا الْمَاحِي الَّذِي يَمْحُو اللَّهُ بِيَ الْكُفْرَ، وَأَنَا الْحَاشِرُ الَّذِي يُحْشَرُ النَّاسُ عَلَى قَدَمِي، وَأَنَا الْعَاقِبُ». [رواه البخاري: ٣٥٣٢]

[1] “əş-Şüəra” surəsi, 214.

[2] Burada Həssan ﭬ Peyğəmbərin ﷺ dədə-babalarının adını çəkməyəcəyini, onları təhqir etməyəcəyini bildirmişdir.

**1469.** Cubeyr ibn Mutim ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim beş adım var: mən həm Muhəmməd[1], həm də Əhmədəm[2], mən Allahın mənim vasitəmlə küfrü yox etdiyi Mahiyəm[3], mən, ayağı altında insanların məhşərə toplandığı Haşirəm[4], mən Aqibəm[5]". (əl-Buxari, 3532)

١٤٧٠ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ: « أَلاَ تَعْجَبُونَ كَيْفَ يَصْرِفُ اللَّهُ عَنِّى شَتْمَ قُرَيْشٍ وَلَعْنَهُمْ يَشْتِمُونَ مُذَمَّمًا وَيَلْعَنُونَ مُذَمَّمًا وَأَنَا مُحَمَّدٌ». [رواه البخاري: ٣٥٣٣]

**1470.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Məgər siz Allahın qureyşlilərin təhqirlərini və lənətlərini məndən necə uzaqlaşdırdığına təəccüblənmirsinizmi? Onlar "muzəmməmi"[6] təhqir edir və "muzəmməmə" lənət oxuyurlar, halbuki mən Muhəmmədəm." (əl-Buxari, 3533)

## 12-ci fəsil. Peyğəmbərlərin ﷺ sonuncusu

## ١٢– باب: خَاتِمُ النَّبِيِّينَ ﷺ

١٤٧١ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّه ﵄ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «مَثَلِى وَمَثَلُ الأَنْبِيَاءِ كَرَجُلٍ بَنَى دَارًا فَأَكْمَلَهَا وَأَحْسَنَهَا، إِلاَّ مَوْضِعَ لَبِنَةٍ، فَجَعَلَ النَّاسُ يَدْخُلُونَهَا وَيَتَعَجَّبُونَ، وَيَقُولُونَ لَوْلاَ مَوْضِعُ اللَّبِنَةِ». [رواه البخاري: ٣٥٣٤]

**1471.** Cabir ibn Abdullah ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim və məndən əvvəlki peyğəmbərlərin məsəli, kamil və gözəl şəkildə bir ev tikmiş, lakin bir küncündə kərpicinin birini qoymamış bir adamın məsəlinə bənzəyir. İnsanlar bu evin içinə daxil olur, ona heyrət edib deyirlər: "Bura bir kərpic qoyulsaydı, (əla olardı)." (əl-Buxari, 3534)

١٤٧٢ – عَنْ أَبِى هُرَيْرَةَ ﵁ أَنَّ رَسُولَ اللَّه ﷺ قَالَ: «إِنَّ مَثَلِى وَمَثَلَ الأَنْبِيَاءِ مِنْ قَبْلِى كَمَثَلِ رَجُلٍ بَنَى بَيْتًا فَأَحْسَنَهُ وَأَجْمَلَهُ، إِلاَّ مَوْضِعَ لَبِنَةٍ مِنْ زَاوِيَةٍ، فَجَعَلَ النَّاسُ يَطُوفُونَ بِهِ وَيَعْجَبُونَ لَهُ، وَيَقُولُونَ هَلاَّ وُضِعَتْ هَذِهِ اللَّبِنَةُ قَالَ فَأَنَا اللَّبِنَةُ، وَأَنَا خَاتِمُ النَّبِيِّينَ». [رواه البخاري: ٣٥٣٥]

**1472.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim və əvvəlki peyğəmbərlərin məsəli, gözəl və heyrətamiz bir ev tikmiş, lakin kərpicinin birini qoymamış bir kimsənin məsəlinə bənzəyir. Camaat bu evin yan-yörəsindən keçir, ona təəccüb edir və deyirlər: "Nə üçün bura bir kərpic qoyulmayıb?" (Sonra) Peyğəmbər ﷺ davam edib dedi: "O kərpic mənəm və mən peyğəmbərlərin sonuncusuyam." (əl-Buxari, 3535)

## 13-cü fəsil. Peyğəmbərin ﷺ vəfatı

## ١٣– باب: وَفَاةُ النَّبِيِّ ﷺ

١٤٧٣ – عَنْ عَائِشَةَ ﵂ أَنَّ النَّبِىَّ ﷺ تُوُفِّىَ وَهُوَ ابْنُ ثَلاَثٍ وَسِتِّينَ. [رواه البخاري: ٣٥٣٦]

---

[1] "Muhəmməd" – Mədh olunan.
[2] "Əhməd" – Mədh olunmağa layiq.
[3] "Mahi" – Silib yox edən.
[4] "Haşir" – Bir yerə toplayan.
[5] "Aqib" – sonuncu.
[6] "Muzəmməm"in hərfi tərcüməsi məzəmmət olunan, alçaq və s. Belə ki, müşriklər vaxtıyla Muhəmməd ﷺ deyib çağırdıqları adamı, öz adı ilə çağırmırdılar, ona "muzəmməm" deyirdilər.

**1473.** Aişə ﵂ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ altmış üç yaşında vəfat etmişdir. (əl-Buxari, 3536)

## 14-cü fəsil ١٤– باب

١٤٧٤ – عَنْ الْجُعَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ رَأَيْتُ السَّائِبَ بْنَ يَزِيدَ ﵁ ابْنَ أَرْبَعٍ وَتِسْعِينَ جَلْدًا مُعْتَدِلاً فَقَالَ قَدْ عَلِمْتُ مَا مُتِّعْتُ بِهِ سَمْعِي وَبَصَرِي إِلاَّ بِدُعَاءِ رَسُولِ اللَّهِ ﷺ، إِنَّ خَالَتِي ذَهَبَتْ بِي إِلَيْهِ فَقَالَتْ يَا رَسُولَ اللَّهِ إِنَّ ابْنَ أُخْتِي شَاكٍ فَادْعُ اللَّهَ. قَالَ فَدَعَا لِي. [رواه البخاري: ٣٥٤٠]

**1474.** Rəvayət edilir ki, Cueyd ibn Abdur-Rəhman demişdir: “Mən Saib ibn Yezidi doxsan dörd yaşında ikən gördüm, çox gümrah qalmışdı, bədənini də şax tuturdu. O deyirdi: “Mən yəqin bilirəm ki, indiyədək yaxşı eşitməyimin və görməyimin yeganə səbəbi ancaq Peyğəmbərin ﷺ duasıdır. Bir dəfə xalam məni onun yanına apardı və: “Ya Rəsulullah, bacım oğlu xəstədir, (onun üçün) Allaha dua et!”– dedi, o da mənim üçün dua etdi.” (əl-Buxari, 3540)

## 15-ci fəsil. Peyğəmbərin ﷺ vəsfi ١٥– باب: صِفَةُ النَّبِيِّ ﷺ

١٤٧٥ – عَنْ عُقْبَةَ بْنِ الْحَارِثِ ﵁ قَالَ: صَلَّى أَبُو بَكْرٍ الْعَصْرَ، ثُمَّ خَرَجَ يَمْشِي فَرَأَى الْحَسَنَ يَلْعَبُ مَعَ الصِّبْيَانِ، فَحَمَلَهُ عَلَى عَاتِقِهِ وَقَالَ بِأَبِي شَبِيهٌ بِالنَّبِيِّ لاَ شَبِيهٌ بِعَلِيٍّ. وَعَلِيٌّ يَضْحَكُ. [رواه البخاري: ٣٥٤٢]

**1475.** Rəvayət edilir ki, Uqbə ibn Haris ﵁ demişdir: “(Bir dəfə) Əbu Bəkr əsr namazını qıldıqdan sonra (evindən) bayıra çıxdı. (Bu vaxt) o, Həsənin uşaqlarla oynadığını gördü və onu çiyninə otuzdurub dedi: “Atam sənə qurban, sən Əlidən çox Peyğəmbərə oxşayırsan.” Əli (bu sözü eşidəndə) güldü.” (əl-Buxari, 3542)

١٤٧٦ – عَنْ أَبِي جُحَيْفَةَ ﵁ قَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ وَكَانَ الْحَسَنُ بْنُ عَلِيٍّ ﵇ يُشْبِهُهُ قُلْتُ لأَبِي جُحَيْفَةَ صِفْهُ لِي. قَالَ كَانَ أَبْيَضَ قَدْ شَمِطَ. وَأَمَرَ لَنَا النَّبِيُّ ﷺ بِثَلاَثَ عَشْرَةَ قَلُوصًا قَالَ فَقُبِضَ النَّبِيُّ قَالَ قَبْلَ أَنْ نَقْبِضَهَا. [رواه البخاري: ٣٥٤٤]

**1476.** Rəvayət edilir ki, Əbu Cuheyfə ﵁ demişdir: “Mən Peyğəmbəri ﷺ görmüşəm. Həsən ibn Əli ﵇ ona oxşayırdı.” (Hədisi danışan ravi) dedi: “Mən Əbu Cuheyfəyə dedim: “Peyğəmbəri ﷺ mənə vəsf et.” O dedi: “O, ağbəniz idi, saqqalına da dən düşmüşdü. Peyğəmbər ﷺ bizə on üç dişi dəvə verilməsini əmr etdi. Biz o dəvələri götürməmişdən əvvəl Peyğəmbər ﷺ vəfat etdi.” (əl-Buxari, 3544)

١٤٧٧ – عَنْ حَرِيزُ بْنُ عُثْمَانَ أَنَّهُ سَأَلَ عَبْدَ اللَّهِ بْنَ بُسْرٍ صَاحِبَ النَّبِيِّ ﷺ قَالَ: أَرَأَيْتَ النَّبِيَّ ﷺ كَانَ شَيْخًا قَالَ كَانَ فِي عَنْفَقَتِهِ شَعَرَاتٌ بِيضٌ. [رواه البخاري: ٣٥٤٦]

**1477.** Cərir ibn Osman ﵁ rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ əshabəsi Abdullah ibn Busrdan soruşdu: “Bir de görək, sən Peyğəmbəri ﷺ qocalığında görmüsənmi?” Dedi: “Onun alt dodaq şırımında bir neçə ağ tük var idi.” (əl-Buxari, 3546)

١٤٧٨ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ رَبْعَةً مِنَ الْقَوْمِ، لَيْسَ بِالطَّوِيلِ وَلاَ بِالْقَصِيرِ، أَزْهَرَ اللَّوْنِ لَيْسَ بِأَبْيَضَ أَمْهَقَ وَلاَ آدَمَ، لَيْسَ بِجَعْدٍ قَطَطٍ وَلاَ سَبْطٍ رَجِلٍ، أُنْزِلَ عَلَيْهِ وَهُوَ ابْنُ أَرْبَعِينَ، فَلَبِثَ بِمَكَّةَ عَشْرَ سِنِينَ يُنْزَلُ عَلَيْهِ وَبِالْمَدِينَةِ عَشْرَ سِنِينَ، وَلَيْسَ فِى رَأْسِهِ وَلِحْيَتِهِ عِشْرُونَ شَعَرَةً بَيْضَاءَ. [رواه البخاري: ٣٥٤٧]

**1478.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ ortaboy bir adam idi, o, nə hündürboy, nə də bəstəboy idi. Onun dərisi qızıla çalırdı, o nə ağappaq, nə də qarayanız idi. Saçları da nə tam qıvrım, nə də dümdüz idi. Qırx yaşında ikən ona vəhy nazil oldu. (Bundan sonra) o, on il Məkkədə[1], on il də Mədinədə qaldı və (həmin illərdə) ona vəhy nazil oldu. (Peyğəmbər ﷺ vəfat etdikdə) onun saç-saqqalında heç iyirmi ədəd ağ tük yox idi." (əl-Buxari, 3547)

١٤٧٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ لَيْسَ بِالطَّوِيلِ الْبَائِنِ وَلاَ بِالْقَصِيرِ، وَلاَ بِالأَبْيَضِ الأَمْهَقِ، وَلَيْسَ بِالآدَمِ وَلَيْسَ بِالْجَعْدِ الْقَطَطِ وَلاَ بِالسَّبْطِ، بَعَثَهُ اللَّهُ عَلَى رَأْسِ أَرْبَعِينَ سَنَةً، فَأَقَامَ بِمَكَّةَ عَشْرَ سِنِينَ، وَبِالْمَدِينَةِ عَشْرَ سِنِينَ، فَتَوَفَّاهُ اللَّهُ، وَلَيْسَ فِى رَأْسِهِ وَلِحْيَتِهِ عِشْرُونَ شَعَرَةً بَيْضَاءَ. [رواه البخاري: ٣٥٤٨]

**1479.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ nə çox hündürboy, nə də bəstəboy idi, nə dümağ dərili, nə də qarayanız idi, saçları da nə tamamilə qıvrım, nə də dümdüz idi. Onun qırx yaşı tamam olduqda Allah onu peyğəmbər göndərdi. (Bundan sonra) o, on il Məkkədə, on il də Mədinədə yaşadı. Allah Peyğəmbərin ﷺ dünyasını dəyişdikdə onun saç-saqqalında heç iyirmi ədəd ağ tük yox idi." (əl-Buxari, 3548)

١٤٨٠ – عَنْ الْبَرَاءِ ﷺ قَالَ، كَانَ رَسُولُ اللَّهِ ﷺ أَحْسَنَ النَّاسِ وَجْهًا وَأَحْسَنَهُ خَلْقًا، لَيْسَ بِالطَّوِيلِ الْبَائِنِ وَلاَ بِالْقَصِيرِ. [رواه البخاري: ٣٥٤٩]

**1480.** Rəvayət edilir ki, Bəra ﷺ demişdir: "Peyğəmbər ﷺ həm zahiri görkəm, həm də əxlaq baxımından insanların ən gözəli idi. O nə çox hündürboy, nə də bəstəboy idi." (əl-Buxari, 3549)

١٤٨١ – عَنْ أَنَسٍ ﷺ أَنَّهُ سُئِلَ: هَلْ خَضَبَ النَّبِيُّ ﷺ؟ قَالَ: لاَ، إِنَّمَا كَانَ شَىْءٌ فِى صُدْغَيْهِ. [رواه البخاري: ٣٥٥٠]

**1481.** Rəvayət edilir ki, (dir dəfə) Ənəsdən ﷺ soruşdular: "Peyğəmbər ﷺ (saçlarını) boyayardımı?" O dedi: "Xeyr, onun hər iki gicgahında (cəmi) bir neçə ağ tük var idi." (əl-Buxari, 3550)

١٤٨٢ – عَنْ الْبَرَاءِ بْنِ عَازِبٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ مَرْبُوعًا، بَعِيدَ مَا بَيْنَ الْمَنْكِبَيْنِ، لَهُ شَعَرٌ يَبْلُغُ شَحْمَةَ أُذُنِهِ، رَأَيْتُهُ فِى حُلَّةٍ حَمْرَاءَ، لَمْ أَرَ شَيْئًا قَطُّ أَحْسَنَ مِنْهُ. [رواه البخاري: ٣٥٥١]

**1482.** Rəvayət edilir ki, Bəra ibn Azib ﷺ demişdir: "Peyğəmbər ﷺ ortaboy, enli kürək bir adam idi. Onun saçları qulağının mərcəyinə çatırdı. Mən onu qırmızı libasda gördüm. Doğrusu, mən heç vaxt ondan yaraşıqlı insan görməmişəm." (əl-Buxari, 3551)

١٤٨٣ – عَنْ الْبَرَاءِ ﷺ أَنَّهُ قِيلَ لَهُ: أَكَانَ وَجْهُ النَّبِيِّ ﷺ مِثْلَ السَّيْفِ؟ قَالَ: لاَ، بَلْ مِثْلَ الْقَمَرِ. [رواه البخاري: ٣٥٥٢]

[1] Əslində, Muhəmmədə ﷺ peyğəmbərlik verildikdən sonra Məkkədə on üç il yaşamış və onun üç ilini gizlin, on ilini isə açıq-aydın dəvət aparmışdır. Bu hədisdə də məhz açıq-aydın dəvət apardığı illər nəzərdə tutulur.

**1483.** Rəvayət edilir ki, Bəradan ﷺ soruşdular: "Peyğəmbərin ﷺ üzü qılınc kimi (parıldayırdımı)?" O dedi: "Xeyr, onun üzü (on dörd gecəlik) ay kimi (nurlu) idi." (əl-Buxari, 3552)

١٤٨٤ – عَنْ أَبِي جُحَيْفَةَ ﷺ قَالَ: خَرَجَ رَسُولُ اللَّهِ ﷺ بِالْهَاجِرَةِ إِلَى الْبَطْحَاءِ فَتَوَضَّأَ ثُمَّ صَلَّى الظُّهْرَ رَكْعَتَيْنِ، وَالْعَصْرَ رَكْعَتَيْنِ، وَبَيْنَ يَدَيْهِ عَنَزَةٌ.

قَالَ أَبِى جُحَيْفَةَ قَالَ كَانَ يَمُرُّ مِنْ وَرَائِهَا الْمَرْأَةُ، وَقَامَ النَّاسُ فَجَعَلُوا يَأْخُذُونَ يَدَيْهِ، فَيَمْسَحُونَ بِهَا وُجُوهَهُمْ، قَالَ فَأَخَذْتُ بِيَدِهِ، فَوَضَعْتُهَا عَلَى وَجْهِى، فَإِذَا هِيَ أَبْرَدُ مِنَ الثَّلْجِ، وَأَطْيَبُ رَائِحَةً مِنَ الْمِسْكِ. [رواه البخاري: ٣٥٥٣]

**1484.** Rəvayət edilir ki, Əbu Cuheyfə ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ günortaçağı Bəthaya[1] gedib dəstəmaz aldı, sonra da önündə yerə sancılmış bir ağac parçası olduğu halda[2] zöhr namazını iki rükət və əsr namazını iki rükət qıldı."

Əbu Cuheyfə demişdir: "(Peyğəmbər ﷺ namazını qılarkən həmin ağac parçasının) arxa tərəfindən qadın keçib gedirdi. Namazdan sonra insanlar ona yaxınlaşıb əllərini onun əlinə toxundurmağa, sonra da üzlərinə sürtməyə başladılar[3]. Mən onun əlini tutub üzümə qoydum və onun qardan soyuq olduğunu, həm də müşkdən daha gözəl iy verdiyini hiss etdim." (əl-Buxari, 3553)

١٤٨٥ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «بُعِثْتُ مِنْ خَيْرِ قُرُونِ بَنِى آدَمَ قَرْنًا فَقَرْنًا، حَتَّى كُنْتُ مِنَ الْقَرْنِ الَّذِى كُنْتُ فِيهِ». [رواه البخاري: ٣٥٥٧]

**1485.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən Adəm oğullarının bir-birinin ardınca gələn ən xeyirli nəsilləri arasından (peyğəmbər) göndərildim və nəhayət, göndərildiyim bu nəsil arasında oldum." (əl-Buxari, 3557)

١٤٨٦ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَسْدِلُ شَعَرَهُ، وَكَانَ الْمُشْرِكُونَ يَفْرُقُونَ رُءُوسَهُمْ فَكَانَ أَهْلُ الْكِتَابِ يَسْدِلُونَ رُءُوسَهُمْ، وَكَانَ رَسُولُ اللَّهِ ﷺ يُحِبُّ مُوَافَقَةَ أَهْلِ الْكِتَابِ فِيمَا لَمْ يُؤْمَرْ فِيهِ بِشَيْءٍ، ثُمَّ فَرَقَ رَسُولُ اللَّهِ ﷺ رَأْسَهُ. [رواه البخاري: ٣٥٥٨]

**1486.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ saçlarını alnına tökərdi, müşriklər isə saçlarını tağ ayırardılar. Kitab əhli də saçlarını alınlarına tökərdilər. Peyğəmbər ﷺ (Allahın) ona buyurduqları istisna olmaqla, digər işlərdə Kitab əhlinə uyğun hərəkət etməyi xoşlayardı. Sonralar o, saçlarını tağ ayırmağa başladı." (əl-Buxari, 3558)

١٤٨٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﷺ قَالَ: لَمْ يَكُنِ النَّبِيُّ ﷺ فَاحِشًا وَلاَ مُتَفَحِّشًا وَكَانَ يَقُولُ: «إِنَّ مِنْ خِيَارِكُمْ أَحْسَنَكُمْ أَخْلاَقًا». [رواه البخاري: ٣٥٥٩]

---

[1] 313-cü hədisin qeydlərinə bax.

[2] Şəriət buna sütrə deyir. Namaz qılanın qarşısındakı sütrənin uzunluğu ən azı yəhərin arxası boyda (təxminən bir qarış) olmalıdır. (Şərhul-Mumti alə Zadul-Mustəqna, 3/208).

[3] Onların məqsədi Peyğəmbərin ﷺ sağlığında onun vasitəsilə bərəkətə nail olmaq idi. Buna da ərəbcə "təbərruk" deyilir. 1317-1319-cu hədislərə bax.

**1487.** Rəvayət edilir ki, Abdullah ibn Amr ﵄ demişdir: "Peyğəmbər ﷺ ədəbsiz və kobud olmamışdır. O deyərdi: "Sizin ən xeyirliniz əxlaqı ən gözəl olanınızdır!" (əl-Buxari, 3559)

١٤٨٨ – عَنْ عَائِشَةَ ﵂ أَنَّهَا قَالَتْ: مَا خُيِّرَ رَسُولُ اللَّهِ ﷺ بَيْنَ أَمْرَيْنِ إِلاَّ أَخَذَ أَيْسَرَهُمَا، مَا لَمْ يَكُنْ إِثْمًا، فَإِنْ كَانَ إِثْمًا كَانَ أَبْعَدَ النَّاسِ مِنْهُ، وَمَا انْتَقَمَ رَسُولُ اللَّهِ ﷺ لِنَفْسِهِ، إِلاَّ أَنْ تُنْتَهَكَ حُرْمَةُ اللَّهِ فَيَنْتَقِمَ لِلَّهِ بِهَا. [رواه البخاري: ٣٥٦٠]

**1488.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbərə ﷺ iki şeydən birini seçmək təklif edildikdə, – günah işlər istisna olmaqla, – həmişə daha asan olanını seçərdi. Günah iş görmək təklif olunduqda isə o, bundan hamıdan çox çəkinərdi. Peyğəmbər ﷺ öz nəfsinə görə heç kəsdən intiqam almamışdır. Yalnız Allahın qoyduğu qanunlar pozulduqda Allaha görə intiqam alardı." (əl-Buxari, 3560)

١٤٨٩ – عَنْ أَنَسٍ ﵁ قَالَ: مَا مَسِسْتُ حَرِيرًا وَلاَ دِيبَاجًا أَلْيَنَ مِنْ كَفِّ النَّبِيِّ ﷺ، وَلاَ شَمِمْتُ رِيحًا قَطُّ أَوْ عَرْفًا قَطُّ أَطْيَبَ مِنْ رِيحِ أَوْ عَرْفِ النَّبِيِّ ﷺ. [رواه البخاري: ٣٥٦١]

**1489.** Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ əlindən daha yumşaq nə bir ipəyə, nə də bir zərxaraya toxunmuşam. Həmçinin mən heç vaxt Peyğəmbərin ﷺ rayihəsindən və iyindən daha xoş iy duymamışam." (əl-Buxari, 3561)

١٤٩٠ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﵁ قَالَ: كَانَ النَّبِيُّ ﷺ أَشَدَّ حَيَاءً مِنَ الْعَذْرَاءِ فِي خِدْرِهَا. [رواه البخاري: ٣٥٦٢]

**1490.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Peyğəmbər ﷺ hücrəsinə çəkilmiş bakirə qızdan daha həyalı idi." (əl-Buxari, 3562)

١٤٩١ – وَ فِي رِوَايَةٍ: وَإِذَا كَرِهَ شَيْئًا عُرِفَ فِي وَجْهِهِ. [رواه البخاري: ٣٥٦٢]

**1491.** Digər rəvayətdə deyilmişdir: "(Peyğəmbərin ﷺ) nə isə xoşuna gəlmədikdə, bunu onun üzündən anlayardıq." (əl-Buxari, 3562)

١٤٩٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: مَا عَابَ النَّبِيُّ ﷺ طَعَامًا قَطُّ، إِنِ اشْتَهَاهُ أَكَلَهُ، وَإِلاَّ تَرَكَهُ. [رواه البخاري: ٣٥٦٣]

**1492.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Peyğəmbər ﷺ heç vaxt heç bir yeməyi pisləməzdi. Yemək xoşuna gəldikdə onu yeyər, əks halda isə onu tərk edərdi." (əl-Buxari, 3563)

١٤٩٣ – عَنْ عَائِشَةَ ﵂ أَنَّ النَّبِيَّ ﷺ كَانَ يُحَدِّثُ حَدِيثًا لَوْ عَدَّهُ الْعَادُّ لأَحْصَاهُ. [رواه البخاري: ٣٥٦٧]

**1493.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ elə bir tərzdə danışardı ki, onun sözlərini saymaq istəyən adam onu saya bilərdi." (əl-Buxari, 3567)

١٤٩٤ – عَنْهَا ﵂ قَالَتْ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ لَمْ يَكُنْ يَسْرُدُ الْحَدِيثَ كَسَرْدِكُمْ. [رواه البخاري: ٣٥٦٨]

**1494.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ sizin kimi tələm-tələsik və qatma-qarışıq danışmazdı." (əl-Buxari, 3568)

## 16-cı fəsil. Peyğəmbərin ﷺ gözləri yatsa da, qəlbi yatmır

## ١٦- باب: كَانَ النَّبِيُّ ﷺ تَنَامُ عَيْنُهُ وَلاَ يَنَامُ قَلْبُهُ

١٤٩٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه يُحَدِّثُ عَنْ لَيْلَةِ أُسْرِيَ بِالنَّبِيِّ ﷺ مِنْ مَسْجِدِ الْكَعْبَةِ جَاءَ ثَلاَثَةُ نَفَرٍ قَبْلَ أَنْ يُوحَى إِلَيْهِ، وَهُوَ نَائِمٌ فِي مَسْجِدِ الْحَرَامِ، فَقَالَ أَوَّلُهُمْ أَيُّهُمْ هُوَ فَقَالَ أَوْسَطُهُمْ هُوَ خَيْرُهُمْ وَقَالَ آخِرُهُمْ خُذُوا خَيْرَهُمْ. فَكَانَتْ تِلْكَ، فَلَمْ يَرَهُمْ حَتَّى جَاءُوا لَيْلَةً أُخْرَى، فِيمَا يَرَى قَلْبُهُ، وَالنَّبِيُّ ﷺ نَائِمَةٌ عَيْنَاهُ وَلاَ يَنَامُ قَلْبُهُ وَكَذَلِكَ الأَنْبِيَاءُ تَنَامُ أَعْيُنُهُمْ وَلاَ تَنَامُ قُلُوبُهُمْ، فَتَوَلاَّهُ جِبْرِيلُ ثُمَّ عَرَجَ بِهِ إِلَى السَّمَاءِ. [رواه البخاري: ٣٥٧٠]

**1495.** Ənəs رضي الله عنه Peyğəmbərin ﷺ gecə ikən Məscidülhəramdan səfərə çıxmasını rəvayət edib demişdir: "Peyğəmbərə ﷺ vəhy nazil olmamışdan əvvəl, o, Məscidülhəramda yatarkən onun yanına üç nəfər[1] gəldi. Birncisi dedi: "Bunlardan hansı odur?" İkincisi dedi: "Bu onların ən xeyirliləridir!" Axırıncısı dedi: "Ən xeyirlisini götürün!" Bu hadisədən sonra Peyğəmbər ﷺ onları görmədi. Nəhayət, başqa bir gecə onlar (yenə) gəldilər. Peyğəmbər ﷺ onları qəlbi ilə gördü. Peyğəmbərin ﷺ gözləri yatsa da, qəlbi yatmazdı. Peyğəmbərlərin hamısı belə olmuşlar, gözləri yatsa da, qəlbləri yatmazdı. Bundan sonra Cəbrail gəlib onu göyə qaldırdı." (əl-Buxari, 3570)

## 17-ci fəsil. İslamda olan peyğəmbərlik əlamətləri

## ١٧- باب: عَلاَمَاتُ النُّبُوَّةِ فِي الإِسْلاَمِ

١٤٩٦ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: أُتِيَ النَّبِيُّ ﷺ بِإِنَاءٍ وَهُوَ بِالزَّوْرَاءِ، فَوَضَعَ يَدَهُ فِي الإِنَاءِ، فَجَعَلَ الْمَاءُ يَنْبُعُ مِنْ بَيْنِ أَصَابِعِهِ، فَتَوَضَّأَ الْقَوْمُ. قِيلَ كَمْ كُنْتُمْ؟ قَالَ: ثَلاَثَمِائَةٍ، أَوْ زُهَاءَ ثَلاَثِمِائَةٍ. [رواه البخاري: ٣٥٧٢]

**1496.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ Zəvrada[2] olarkən bir qab (su) gətirdilər və o, əlini qabın içinə saldı. (Bundan sonra) onun barmaqları arasından su qaynayıb çıxmağa başladı və (yanındakı) adamların hamısı (bu su ilə) dəstəmaz aldı."

(Ənəsdən) soruşdular: "Siz neçə (nəfər) idiniz?" Dedi: "Üç yüz və ya üç yüzə yaxın."(əl-Buxari, 3582)

١٤٩٧ – عَنْ عَبْدِ اللَّهِ رضي الله عنه قَالَ: كُنَّا نَعُدُّ الآيَاتِ بَرَكَةً وَأَنْتُمْ تَعُدُّونَهَا تَخْوِيفًا، كُنَّا مَعَ رَسُولِ اللَّهِ ﷺ فِي سَفَرٍ فَقَلَّ الْمَاءُ فَقَالَ: «اطْلُبُوا فَضْلَةً مِنْ مَاءٍ». فَجَاءُوا بِإِنَاءٍ فِيهِ مَاءٌ قَلِيلٌ، فَأَدْخَلَ يَدَهُ فِي الإِنَاءِ، ثُمَّ قَالَ: «حَيَّ عَلَى الطَّهُورِ الْمُبَارَكِ، وَالْبَرَكَةُ مِنَ اللَّهِ» فَلَقَدْ رَأَيْتُ الْمَاءَ يَنْبُعُ مِنْ بَيْنِ أَصَابِعِ رَسُولِ اللَّهِ ﷺ، وَلَقَدْ كُنَّا نَسْمَعُ تَسْبِيحَ الطَّعَامِ وَهُوَ يُؤْكَلُ. [رواه البخاري: ٣٥٧٩]

**1497.** Rəvayət edilir ki, Abdullah ibn Məsud رضي الله عنه demişdir: "Biz möcüzələri bərəkət hesab edirdik, siz isə onları (insanları) qorxutmaq üçün səbəb hesab edirsiniz. (Bir dəfə) biz Peyğəmbərlə ﷺ birgə səfərdə olarkən (özümüzlə götürdüyümüz) su azaldı. Onda Peyğəmbər ﷺ: "Artıq qalmış suyu gətirin!"– dedi və ona içində az miqdarda su olan bir qab gətirdilər. O, əlini qabın içinə saldı,

[1] Yəni mələklər.
[2] Mədinə bazarının yaxınlığındakı yer.

sonra buyurdu: "Haydı gəlin mübarək sudan (dəstəmaz) alın. Bərəkət Allahdandır!" Mən Peyğəmbərin ﷺ barmaqları arasından su qaynayıb çıxdığını gördüm. Habelə, biz yemək yeyərkən yeməyin (Allahın şəninə) təriflər dediyini eşidərdik." (əl-Buxari, 3579)

١٤٩٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لاَ تَقُومُ السَّاعَةُ حَتَّى تُقَاتِلُوا قَوْمًا نِعَالُهُمُ الشَّعَرُ، وَحَتَّى تُقَاتِلُوا التُّرْكَ، صِغَارَ الأَعْيُنِ، حُمْرَ الْوُجُوهِ، ذُلْفَ الأُنُوفِ كَأَنَّ وُجُوهَهُمُ الْمَجَانُّ الْمُطْرَقَةُ، وَتَجِدُونَ مِنْ خَيْرِ النَّاسِ أَشَدَّهُمْ كَرَاهِيَةً لِهَذَا الأَمْرِ، حَتَّى يَقَعَ فِيهِ، وَالنَّاسُ مَعَادِنُ، خِيَارُهُمْ فِي الْجَاهِلِيَّةِ خِيَارُهُمْ فِي الإِسْلاَمِ، وَلَيَأْتِيَنَّ عَلَى أَحَدِكُمْ زَمَانٌ لأَنْ يَرَانِي أَحَبُّ إِلَيْهِ مِنْ أَنْ يَكُونَ لَهُ مِثْلُ أَهْلِهِ وَمَالِهِ». [رواه البخاري: ٣٥٨٧-٣٥٨٩]

**1498.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Siz tükdən qayırılmış səndəllər geyinmiş adamlarla döyüşməyincə, habelə qıyıq gözlü, qırmızısifət, yastıburun, üzləri də döymə qalxana bənzər türklərlə vuruşmayınca Qiyamət qopmayacaq. Siz insanların ən xeyirlisinin, özünə (hakimiyyət) təklif edilənədək buna ən çox nifrət edən kimsələr olduğunu görəcəksiniz. İnsanlar mədənlər[1] kimidirlər. Cahiliyyət dövründə onların xeyirli olanları İslamda da xeyirli olarlar. Siz elə bir zamana yetişəcəksiniz ki, (həmin vaxt hər biriniz) ailə və mal-dövlət sahibi olmaqdan daha çox məni görmək istəyəcəkdir." (əl-Buxari, 3587-3589)

١٤٩٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: «لاَ تَقُومُ السَّاعَةُ حَتَّى تُقَاتِلُوا خُوزًا وَكَرْمَانَ مِنَ الأَعَاجِمِ، حُمْرَ الْوُجُوهِ، فُطْسَ الأُنُوفِ، صِغَارَ الأَعْيُنِ، وُجُوهُهُمُ الْمَجَانُّ الْمُطْرَقَةُ، نِعَالُهُمُ الشَّعَرُ». [رواه البخاري: ٣٥٩٠]

**1499.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Siz əcəmdən qırmızısifət, yastıburun, qıyıq gözlü, üzləri döymə qalxana bənzər, səndəlləri də tükdən olan xuzlar və kirmanlılarla vuruşmayınca Qiyamət qopmayacaq." (əl-Buxari, 3590)

١٥٠٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «يُهْلِكُ النَّاسَ هَذَا الْحَيُّ مِنْ قُرَيْشٍ». قَالُوا فَمَا تَأْمُرُنَا قَالَ: «لَوْ أَنَّ النَّاسَ اعْتَزَلُوهُمْ». [رواه البخاري: ٣٦٠٤]

**1500.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar Qureyşdən olan bir nəsilin əlində məhv olacaq[2]. (Əshabələr): "Bizə nə buyurursan?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Yaxşı olar ki, insanlar onlardan uzaq dursunlar." (əl-Buxari, 3604)

١٥٠١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ الصَّادِقَ الْمَصْدُوقَ يَقُولُ: «هَلاَكُ أُمَّتِي عَلَى يَدَيْ غِلْمَةٍ مِنْ قُرَيْشٍ». إِنْ شِئْتَ أَنْ أُسَمِّيَهُمْ بَنِي فُلاَنٍ وَبَنِي فُلاَنٍ. [رواه البخاري: ٣٦٠٥]

**1501.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən doğru danışan və doğruluğu təsdiq edilmiş Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Mənim ümmətim Qureyşdən olan bir neçə yeniyetmənin əlində məhv olacaq."

[1] 1451-ci hədisin qeydlərinə bax.

[2] Hədisdə qureyşdən olub hakimiyyət davası edən bəzi çılğın adamların atdığı səhv addımlar nəticəsində müsəlman ümmətinin başına gələcək müsibətlər nəzərdə tutulur. Həqiqətən də, Peyğəmbər ﷺ dediyi kimi olmuşdur. (Fəthul-Bari)

(Əbu Hureyra Mərvan ibn Həkəmə dedi): "İstəyirsənsə, onların adlarını (sənə) verə bilərəm: (bu) filankəsin oğulları və filankəsin oğullarıdır." (əl-Buxari, 3605)

١٥٠٢ – عَنْ حُذَيْفَةَ بْنَ الْيَمَانِ ﷺ قَالَ: كَانَ النَّاسُ يَسْأَلُونَ رَسُولَ اللَّهِ ﷺ عَنِ الْخَيْرِ، وَكُنْتُ أَسْأَلُهُ عَنِ الشَّرِّ مَخَافَةَ أَنْ يُدْرِكَنِى. فَقُلْتُ يَا رَسُولَ اللَّهِ إِنَّا كُنَّا فِى جَاهِلِيَّةٍ وَشَرٍّ، فَجَاءَنَا اللَّهُ بِهَذَا الْخَيْرِ، فَهَلْ بَعْدَ هَذَا الْخَيْرِ مِنْ شَرٍّ قَالَ: «نَعَمْ». قُلْتُ وَهَلْ بَعْدَ ذَلِكَ الشَّرِّ مِنْ خَيْرٍ قَالَ: «نَعَمْ، وَفِيهِ دَخَنٌ». قُلْتُ وَمَا دَخَنُهُ قَالَ: «قَوْمٌ يَهْدُونَ بِغَيْرِ هَدْيِى تَعْرِفُ مِنْهُمْ وَتُنْكِرُ». قُلْتُ فَهَلْ بَعْدَ ذَلِكَ الْخَيْرِ مِنْ شَرٍّ قَالَ: «نَعَمْ دُعَاةٌ إِلَى أَبْوَابِ جَهَنَّمَ، مَنْ أَجَابَهُمْ إِلَيْهَا قَذَفُوهُ فِيهَا». قُلْتُ يَا رَسُولَ اللَّهِ صِفْهُمْ لَنَا فَقَالَ: «هُمْ مِنْ جِلْدَتِنَا، وَيَتَكَلَّمُونَ بِأَلْسِنَتِنَا» قُلْتُ فَمَا تَأْمُرُنِى إِنْ أَدْرَكَنِى ذَلِكَ قَالَ: «تَلْزَمُ جَمَاعَةَ الْمُسْلِمِينَ وَإِمَامَهُمْ». قُلْتُ فَإِنْ لَمْ يَكُنْ لَهُمْ جَمَاعَةٌ وَلاَ إِمَامٌ قَالَ: «فَاعْتَزِلْ تِلْكَ الْفِرَقَ كُلَّهَا، وَلَوْ أَنْ تَعَضَّ بِأَصْلِ شَجَرَةٍ حَتَّى يُدْرِكَكَ الْمَوْتُ وَأَنْتَ عَلَى ذَلِكَ». [رواه البخاري: ٣٦٠٦]

**1502.** Rəvayət edilir ki, Huzeyfə ibn Yəmən ﷺ demişdir: "İnsanlar Peyğəmbərdən ﷺ xeyirxah işlər barədə soruşardılar, mən isə ondan şər əməllər barəsində soruşardım ki, xətəri mənə dəyməsin. Mən dedim: "Ya Rəsulullah, biz, həqiqətən də, cahillik və şər içində yaşayırdıq. Allah bizə belə bir xeyir[1] nəsib etdi. Bu xeyirdən sonra şər gələ bilərmi?" (Peyğəmbər ﷺ): "Bəli!"- dedi. Mən soruşdum: "Bəs bu şərdən sonra (yenə) xeyir gələ bilərmi?" (Peyğəmbər ﷺ) dedi: "Bəli, lakin bu xeyirə (şər) ləkəsi bulaşacaqdır." Mən soruşdum: "O nə ləkədir?" Dedi: "Mənim yolumu tutub getməyən adamlar olacaq. Onlar yaxşı işlər gördükləri kimi, pis əməllər də edəcəklər." Mən soruşdum: "Bəs bu xeyirdən sonra şər gələcəkmi?" Dedi: "Bəli, həmin vaxt Cəhənnəmə çağıran (azğın) adamlar olacaq. Kim onların çağırışını qəbul etsə, Cəhənnəmə atılacaqdır." Mən dedim: "Ya Rəsulullah, onları bizə vəsf et!" O buyurdu: "Onlar bizlərdən olacaq və bizim kimi danışacaqlar." Soruşdum: "O vaxta qədər yaşasam, mən nə edim?" Buyurdu ki: "Müsəlman camaatına qoşul və onların imamına tabe ol!" Dedim: "Bəs onların nə bir camaatı, nə də bir imamı olmasa necə?" Dedi: "Arxa dişlərinlə ağac kökündən yapışmış olsan belə, o firqələrin hamısından uzaq dur və ölüm səni haqlayanadək bu vəziyyətdə qal!" (əl-Buxari, 3606)

١٥٠٣ – عَنْ عَلِيٍّ ﷺ قَالَ: إِذَا حَدَّثْتُكُمْ عَنْ رَسُولِ اللَّهِ ﷺ فَلأَنْ أَخِرَّ مِنَ السَّمَاءِ أَحَبُّ إِلَيَّ مِنْ أَنْ أَكْذِبَ عَلَيْهِ، وَإِذَا حَدَّثْتُكُمْ فِيمَا بَيْنِى وَبَيْنَكُمْ، فَإِنَّ الْحَرْبَ خَدْعَةٌ، سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «يَأْتِى فِى آخِرِ الزَّمَانِ قَوْمٌ حُدَثَاءُ الأَسْنَانِ، سُفَهَاءُ الأَحْلاَمِ، يَقُولُونَ مِنْ خَيْرِ قَوْلِ الْبَرِيَّةِ، يَمْرُقُونَ مِنَ الإِسْلاَمِ كَمَا يَمْرُقُ السَّهْمُ مِنَ الرَّمِيَّةِ، لاَ يُجَاوِزُ إِيمَانُهُمْ حَنَاجِرَهُمْ، فَأَيْنَمَا لَقِيتُمُوهُمْ فَاقْتُلُوهُمْ، فَإِنَّ قَتْلَهُمْ أَجْرٌ لِمَنْ قَتَلَهُمْ يَوْمَ الْقِيَامَةِ». [رواه البخاري: ٣٦١١]

**1503.** Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Mən Peyğəmbərdən ﷺ bir hədis rəvayət etsəm, bilin ki, mənim üçün guruppultu ilə göydən yerə düşmək, Peyğəmbərin ﷺ adından yalan danışmaqdan daha yaxşıdır. Söhbət öz aramızda qalsın, bilin ki, müharibə aldatmadır[2]. Mən Peyğəmbərin ﷺ belə dediyini

[1] Burada İslam dininin və Muhəmmədin ﷺ peyğəmbər olaraq göndərilməsi nəzərdə tutulur.
[2] Yəni dediyi ikibaşlı və ikimənalı ola bilər.

eşitmişəm: "Axır zamanda yaşları az, beyinləri küt olan kimsələr gələcəklər. Onlar ən xeyirli sözləri danışacaqlar, (lakin) ox ovunu dəlib keçdiyi kimi İslamdan çıxacaqlar. Onların imanı xirtdəklərindən o yana keçməyəcəkdir. Odur ki, onları harada görsəniz, öldürün! Şübhəsiz ki, onları öldürən kimsələrə Qiyamət günü bunun müqabilində mükafat veriləcəkdir." (əl-Buxari, 3611)

١٥٠٤ – عَنْ خَبَّاب بْنِ الأَرَتِّ ﷺ قَالَ: شَكَوْنَا إِلَى رَسُولِ اللَّهِ ﷺ وَهُوَ مُتَوَسِّدٌ بُرْدَةً لَهُ فِى ظِلِّ الْكَعْبَةِ، قُلْنَا لَهُ أَلاَ تَسْتَنْصِرُ لَنَا أَلاَ تَدْعُو اللَّهَ لَنَا قَالَ: «كَانَ الرَّجُلُ فِيمَنْ قَبْلَكُمْ يُحْفَرُ لَهُ فِى الأَرْضِ فَيُجْعَلُ فِيهِ، فَيُجَاءُ بِالْمِنْشَارِ، فَيُوضَعُ عَلَى رَأْسِهِ فَيُشَقُّ بِاثْنَتَيْنِ، وَمَا يَصُدُّهُ ذَلِكَ عَنْ دِينِهِ، وَيُمْشَطُ بِأَمْشَاطِ الْحَدِيدِ، مَا دُونَ لَحْمِهِ مِنْ عَظْمٍ أَوْ عَصَبٍ، وَمَا يَصُدُّهُ ذَلِكَ عَنْ دِينِهِ، وَاللَّهِ لَيُتِمَّنَّ هَذَا الأَمْرَ حَتَّى يَسِيرَ الرَّاكِبُ مِنْ صَنْعَاءَ إِلَى حَضْرَمَوْتَ، لاَ يَخَافُ إِلاَّ اللَّهَ أَوِ الذِّئْبَ عَلَى غَنَمِهِ، وَلَكِنَّكُمْ تَسْتَعْجِلُونَ». [رواه البخاري: ٣٦١٢]

**1504.** Rəvayət edilir ki, Xəbbab ibn Ərat ﷺ demişdir: "Peyğəmbər ﷺ libasına bürünüb Kəbənin kölgəsində dincələrkən biz onun yanına gəldik və ona şikayət edib dedik: "Bizim üçün kömək diləməyəcəksənmi? Bizim üçün Allaha dua etməyəcəksənmi?" O buyurdu: "Sizdən əvvəl yaşamış (möminlərdən) birisini tutub torpağa basdırardılar, sonra da mişar gətirib onun başının tən ortasına qoyar və onu iki hissəyə bölərdilər, lakin bu (işgəncə) onu dinindən döndərə bilməzdi. Kimisini də dəmir daraqlarla başını ta sümüyədək və ya sinirinədək darayardılar, lakin bu (əzab) onu dinindən döndərə bilməzdi. Vallahi, Allah bu dini tamamlayacaq[1], hətta iş o yerə gəlib çatacaq ki, atlı Sənadan Hədrəmövtə səfər edəcək və (yolda) Allahdan başqa heç kəsdən və ya canavarın qoyunlarına hücum edəcəyindən başqa heç nədən qorxmayacaqdır. Lakin siz tələsirsiniz." (əl-Buxari, 3612)

١٥٠٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّ النَّبِىَّ ﷺ افْتَقَدَ ثَابِتَ بْنَ قَيْسٍ، فَقَالَ رَجُلٌ يَا رَسُولَ اللَّهِ، أَنَا أَعْلَمُ لَكَ عِلْمَهُ. فَأَتَاهُ فَوَجَدَهُ جَالِسًا فِى بَيْتِهِ مُنَكِّسًا رَأْسَهُ، فَقَالَ مَا شَأْنُكَ فَقَالَ شَرٌّ، كَانَ يَرْفَعُ صَوْتَهُ فَوْقَ صَوْتِ النَّبِىِّ ﷺ فَقَدْ حَبِطَ عَمَلُهُ، وَهُوَ مِنْ أَهْلِ النَّارِ. فَأَتَى الرَّجُلُ فَأَخْبَرَهُ أَنَّهُ قَالَ كَذَا وَكَذَا. فَقَالَ: «اذْهَبْ إِلَيْهِ فَقُلْ لَهُ إِنَّكَ لَسْتَ مِنْ أَهْلِ النَّارِ، وَلَكِنْ مِنْ أَهْلِ الْجَنَّةِ». [رواه البخاري: ٣٦١٣]

**1505.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ Sabit ibn Qeysi aralarında görmədi. (Əshabələrdən) biri dedi: "Ya Rəsulullah, mən (gedib) onun barəsində sənə xəbər gətirərəm. O gedib (Sabiti) öz evində başı aşağı oturduğunu gördü və (ondan): "Vəziyyətin necədir?"– deyə soruşdu. Sabit: "Pisdir!"– dedi. (Sabit düşünürdü ki,) səsini Peyğəmbərin ﷺ səsindən yüksəyə qaldırmaqla əməlləri puç olmuşdur və artıq o, Cəhənnəm əhlindəndir. Adam Peyğəmbərin ﷺ yanına gəlib ona xəbər verdi ki, Sabit belə-belə dedi. Peyğəmbər ﷺ buyurdu: "Get onun yanına və ona de ki: "Sən Cəhənnəm əhlindən yox, əksinə Cənnət əhlindənsən!" (əl-Buxari, 3613)

١٥٠٦ – عَنْ الْبَرَاءَ بْنَ عَازِبٍ ﷺ قَرَأَ رَجُلٌ الْكَهْفَ وَفِى الدَّارِ الدَّابَّةُ فَجَعَلَتْ تَنْفِرُ فَسَلَّمَ، فَإِذَا ضَبَابَةٌ – أَوْ سَحَابَةٌ – غَشِيَتْهُ، فَذَكَرَهُ لِلنَّبِىِّ ﷺ فَقَالَ: «اقْرَأْ فُلاَنُ، فَإِنَّهَا السَّكِينَةُ نَزَلَتْ لِلْقُرْآنِ، أَوْ تَنَزَّلَتْ لِلْقُرْآنِ». [رواه البخاري: ٣٦١٤]

[1] Bax: "əl-Maidə" surəsi, 3.

**1506.** Bəra ibn Azib ﷺ rəvayət edir ki, (bir dəfə əshabələrdən) biri "əl-Kəhf" surəsini oxudu. Bu vaxt həyətdə olan at (təşviş içində) vurnuxmağa başladı. Adam salamları verib (namazı bitirdikdə) baxdı ki, başının üstünü duman və ya bulud alıb. O bu hadisəni Peyğəmbərə ﷺ danışdı və Peyğəmbər ﷺ dedi: "Oxumağına davam et, ey filankəs! Çünki o, Qurana görə nazil olmuş sükunətdir.[1]" (əl-Buxari, 3614)

١٥٠٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ دَخَلَ عَلَى أَعْرَابِيٍّ – يَعُودُهُ – قَالَ: وَكَانَ النَّبِيُّ ﷺ إِذَا دَخَلَ عَلَى مَرِيضٍ يَعُودُهُ قَالَ لاَ بَأْسَ طَهُورٌ إِنْ شَاءَ اللَّهُ. فَقَالَ لَهُ: «لاَ بَأْسَ طَهُورٌ إِنْ شَاءَ اللَّهُ». قَالَ قُلْتَ طَهُورٌ كَلاَّ بَلْ هِيَ حُمَّى تَفُورُ – أَوْ تَثُورُ – عَلَى شَيْخٍ كَبِيرٍ، تُزِيرُهُ الْقُبُورَ. فَقَالَ النَّبِيُّ ﷺ: «فَنَعَمْ إِذًا». [رواه البخاري: ٣٦١٦]

**1507.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ (həmişə) xəstəni ziyarət etdikdə ona: "Eybi yoxdur, inşallah, (günahların) təmizlənir!"– deyərdi. (Yenə bir dəfə) Peyğəmbər ﷺ xəstə bir bədəviyə baş çəkmək üçün onun yanına gəlib: "Eybi yoxdur, inşallah, (günahların) təmizlənir!"– dedi. Bədəvi isə (cavabında) ona dedi: "Təmizlənir"– dedin?! Xeyr, bu, ixtiyar çağında olan qocanın bədənində od kimi yanan (və ya qaynayan) bir qızdırmadır ki, onu qəbirə aparsın." Peyğəmbər ﷺ buyurdu: "Yaxşı, qoy sən deyən olsun!" (əl-Buxari, 3616)

١٥٠٨ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ رَجُلٌ نَصْرَانِيًّا فَأَسْلَمَ وَقَرَأَ الْبَقَرَةَ وَآلَ عِمْرَانَ، فَكَانَ يَكْتُبُ لِلنَّبِيِّ ﷺ، فَعَادَ نَصْرَانِيًّا فَكَانَ يَقُولُ مَا يَدْرِى مُحَمَّدٌ إِلاَّ مَا كَتَبْتُ لَهُ، فَأَمَاتَهُ اللَّهُ فَدَفَنُوهُ، فَأَصْبَحَ وَقَدْ لَفَظَتْهُ الأَرْضُ فَقَالُوا هَذَا فِعْلُ مُحَمَّدٍ وَأَصْحَابِهِ، لَمَّا هَرَبَ مِنْهُمْ نَبَشُوا عَنْ صَاحِبِنَا. فَأَلْقَوْهُ فَحَفَرُوا لَهُ فَأَعْمَقُوا، فَأَصْبَحَ وَقَدْ لَفَظَتْهُ الأَرْضُ، فَقَالُوا هَذَا فِعْلُ مُحَمَّدٍ وَأَصْحَابِهِ نَبَشُوا عَنْ صَاحِبِنَا لَمَّا هَرَبَ مِنْهُمْ. فَأَلْقَوْهُ فَحَفَرُوا لَهُ، وَأَعْمَقُوا لَهُ فِى الأَرْضِ مَا اسْتَطَاعُوا، فَأَصْبَحَ قَدْ لَفَظَتْهُ الأَرْضُ، فَعَلِمُوا أَنَّهُ لَيْسَ مِنَ النَّاسِ فَأَلْقَوْهُ. [رواه البخاري: ٣٦١٧]

**1508.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "(Vaxtı ilə) bir xristian İslamı qəbul etmişdi. O, "əl-Bəqərə" və "Ali-İmran" surələrini oxuyub (öyrəndi), Peyğəmbər ﷺ üçün bəzi surələri yazdı, lakin sonra yenə xristianlığına qayıtdı. (Bu adam hər yerdə) danışırdı ki: "Muhəmməd mənim onun üçün yazdıqlarımdan başqa heç nə bilmir." (Çox keçmədən) Allah onun canını aldı və (yaxınları) onu dəfn etdilər. Ertəsi gün səhər oyanıb gördülər ki, torpaq onu bayıra atmışdır. Dedilər: "Bu, Muhəmmədin və onun əshabələrinin işi olacaq. Yoldaşımız onların dinindən döndüyünə görə onu qəbirdən çıxardıb bayıra atıblar." Sonra onlar dərin bir qəbir qazıb onu dəfn etdilər. Səhər oyanıb gördülər ki, torpaq (yenə) onu bayıra atmışdır. Dedilər: "Bunu Muhəmməd və onun əshabələri edib. Yoldaşımız onların dinindən döndüyünə görə onu qəbirdən çıxardıb bayıra atıblar." Sonra olduqca dərin bir qəbir qazıb onu dəfn etdilər. Səhər oyanıb gördülər ki, torpaq (yenə də) onu bayıra atmışdır. Nəhayət, başa düşdülər ki, bu işdə insan əli ola bilməz. Odur ki, onu (olduğu yerdə) atıb getdilər." (əl-Buxari, 3617)

[1] Uca Allah "əl-Fəth" surəsinin 4-cü ayəsində buyurur: "Möminlərin imanı üstünə iman artırmaq üçün onların qəlbinə rahatlıq (sükunət, arxayınlıq) nazil edən Odur. Göylərin və yerin orduları Allahındır. Allah Biləndir, Müdrikdir." Təfsirçilər sükunətin mələklərlə bərabər yerə endiyini söyləmişlər.

**١٥٠٩ –** عَنْ جَابِرٍ ﵁ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «هَلْ لَكُمْ مِنْ أَنْمَاطٍ». قُلْتُ وَأَنَّى يَكُونُ لَنَا الأَنْمَاطُ قَالَ: «أَمَا إِنَّهُ سَيَكُونُ لَكُمُ الأَنْمَاطُ». فَأَنَا أَقُولُ لَهَا – يَعْنِى امْرَأَتَهُ – أَخِّرِى عَنِّى أَنْمَاطَكِ. فَتَقُولُ أَلَمْ يَقُلِ النَّبِىُّ ﷺ: «إِنَّهَا سَتَكُونُ لَكُمُ الأَنْمَاطُ». فَأَدَعُهَا. [رواه البخاري: ٣٦٣١]

**1509.** Cabir ﵁ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ (məndən) soruşdu: “Sizdə xalça varmı?” Dedim: “Bizim haradan xalçamız ola bilər?” O buyurdu: “Tezliklə sizin xalçalarınız olacaq!”

(Zamanı yetişdikdə) mən zövcəmə dedim: “Yığışdır bu xalçaları mənim gözümün qabağından.” Zövcəm dedi: “Məgər Peyğəmbər ﷺ (bizə): “Tezliklə sizin xalçalarınız olacaq!”– deyə xəbər verməmişdirmi?” Bundan sonra mən onu sərbəst buraxdım.” (əl-Buxari, 3631)

**١٥١٠ –** عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﵁ قَالَ: انْطَلَقَ سَعْدُ بْنُ مُعَاذٍ مُعْتَمِرًا – قَالَ – فَنَزَلَ عَلَى أُمَيَّةَ بْنِ خَلَفٍ أَبِى صَفْوَانَ، وَكَانَ أُمَيَّةُ إِذَا انْطَلَقَ إِلَى الشَّأْمِ فَمَرَّ بِالْمَدِينَةِ نَزَلَ عَلَى سَعْدٍ، فَقَالَ أُمَيَّةُ لِسَعْدٍ انْتَظِرْ حَتَّى إِذَا انْتَصَفَ النَّهَارُ، وَغَفَلَ النَّاسُ انْطَلَقْتُ فَطُفْتُ، فَبَيْنَا سَعْدٌ يَطُوفُ إِذَا أَبُو جَهْلٍ فَقَالَ مَنْ هَذَا الَّذِى يَطُوفُ بِالْكَعْبَةِ فَقَالَ سَعْدٌ أَنَا سَعْدٌ. فَقَالَ أَبُو جَهْلٍ تَطُوفُ بِالْكَعْبَةِ آمِنًا، وَقَدْ آوَيْتُمْ مُحَمَّدًا وَأَصْحَابَهُ فَقَالَ نَعَمْ. فَتَلاَحَيَا بَيْنَهُمَا. فَقَالَ أُمَيَّةُ لِسَعْدٍ لاَ تَرْفَعْ صَوْتَكَ عَلَى أَبِى الْحَكَمِ، فَإِنَّهُ سَيِّدُ أَهْلِ الْوَادِى. ثُمَّ قَالَ سَعْدٌ وَاللَّهِ لَئِنْ مَنَعْتَنِى أَنْ أَطُوفَ بِالْبَيْتِ لأَقْطَعَنَّ مَتْجَرَكَ بِالشَّأْمِ. قَالَ فَجَعَلَ أُمَيَّةُ يَقُولُ لِسَعْدٍ لاَ تَرْفَعْ صَوْتَكَ. وَجَعَلَ يُمْسِكُهُ، فَغَضِبَ سَعْدٌ فَقَالَ دَعْنَا عَنْكَ، فَإِنِّى سَمِعْتُ مُحَمَّدًا ﷺ يَزْعُمُ أَنَّهُ قَاتِلُكَ. قَالَ إِيَّاىَ قَالَ نَعَمْ. قَالَ وَاللَّهِ مَا يَكْذِبُ مُحَمَّدٌ ﷺ إِذَا حَدَّثَ. فَرَجَعَ إِلَى امْرَأَتِهِ، فَقَالَ أَمَا تَعْلَمِينَ مَا قَالَ لِى أَخِى الْيَثْرِبِىُّ قَالَتْ وَمَا قَالَ قَالَ زَعَمَ أَنَّهُ سَمِعَ مُحَمَّدًا يَزْعُمُ أَنَّهُ قَاتِلِى. قَالَتْ فَوَاللَّهِ مَا يَكْذِبُ مُحَمَّدٌ. قَالَ فَلَمَّا خَرَجُوا إِلَى بَدْرٍ، وَجَاءَ الصَّرِيخُ قَالَتْ لَهُ امْرَأَتُهُ أَمَا ذَكَرْتَ مَا قَالَ لَكَ أَخُوكَ الْيَثْرِبِىُّ قَالَ فَأَرَادَ أَنْ لاَ يَخْرُجَ، فَقَالَ لَهُ أَبُو جَهْلٍ إِنَّكَ مِنْ أَشْرَافِ الْوَادِى، فَسِرْ يَوْمًا أَوْ يَوْمَيْنِ، فَسَارَ مَعَهُمْ فَقَتَلَهُ اللَّهُ. [رواه البخاري: ٣٦٣٢]

**1510.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﵁ demişdir: “Səd ibn Muaz ümrə ziyarətinə yola düşdü və (gedib) Umeyyə ibn Xələfin (evində) qonaq qaldı. Umeyyə də Şama gedərkən Mədinədən keçər və Sədin (evində) qonaq qalardı. Umeyyə Sədə dedi: “Günortayadək gözlə, insanlar yuxuya dalsın, sonra get ümrəni yerinə yetir.” Səd (Kəbəni) təvaf edərkən Əbu Cəhl ona rast gəldi və soruşdu: “Bu kimdir, Kəbəni təvaf edir?” Səd: “Mənəm Səd!”- deyə cavab verdi. Əbu Cəhl dedi: “Muhəmmədə və onun əshabələrinə sığınacaq verirsiniz, (sonra da gəlib) arxayın Kəbəni təvaf edirsən?!” Səd: “Bəli!”- dedi və onlar mübahisə etməyə başladılar. Bu vaxt Umeyyə Sədə dedi: “Səsini Əbul Həkəmin səsindən yuxarı qaldırma. Çünki o, bu vadidə yaşayan adamların ağsaqqalıdır.” Sonra Səd dedi: “Vallahi, əgər sən mənə Kəbəni təvaf etməyə mane olsan, mən də sənə Şamda ticarət etməyə imkan verməyəcəyəm.” Umeyyə onun yaxasından yapışıp: “Səsini qaldırma!”- dedi. Səd qəzəblənib dedi: “Əl çək bizdən! Mən Muhəmmədin ﷺ səni öldürəcəyini iddia etdiyini eşitmişəm.” Umeyyə: “Məni?”- deyə soruşdu. Səd: “Bəli!”- deyə cavab verdi. Umeyyə dedi: “Vallahi, Muhəmməd ﷺ bir xəbər verərsə, yalan danışmaz.” Sonra o, arvadının yanına gəlib dedi: “Bilirsən, yəsribli qardaşım mənə nə dedi?” Qadın soruşdu: “Nə dedi?” (Umeyyə) dedi: “İddia etdi ki, o, Muhəmmədin məni öldürəcəyini söylədiyini eşitmişdir.” Arvadı dedi: “Vallahi, Muhəmməd yalan danışmaz.”

(Müşriklər) Bədr döyüşünə çıxdıqları zaman carçı gəlib (Umeyyəni) çağırdı. Onda arvadi ona dedi: “Yoxsa yəsribli qardaşının sənə dedikləri yadından çıxıb?!” Umeyyə döyüşə çıxmaq istəmədi, lakin Əbu Cəhl ona dedi: “Axı sən bu vadidə yaşayanların ağsaqqallarındansan. Bir-iki günlük (bizimlə) səfərə çıx!” Beləliklə, (Umeyyə) onlarla birlikdə səfərə çıxdı və (Bədr döyüşündə) Allah onu məhv etdi.” (əl-Buxari, 3632)

١٥١١ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ رضي الله عنهما أَنَّ جِبْرِيلَ عليه السلام أَتَى النَّبِيَّ ﷺ وَعِنْدَهُ أُمُّ سَلَمَةَ، فَجَعَلَ يُحَدِّثُ ثُمَّ قَامَ، فَقَالَ النَّبِيُّ ﷺ لأُمِّ سَلَمَةَ: «مَنْ هَذَا». أَوْ كَمَا قَالَ. قَالَ قَالَتْ هَذَا دِحْيَةُ. قَالَتْ أُمُّ سَلَمَةَ ايْمُ اللَّهِ مَا حَسِبْتُهُ إِلاَّ إِيَّاهُ حَتَّى سَمِعْتُ خُطْبَةَ نَبِيِّ اللَّهِ ﷺ يُخْبِرُ جِبْرِيلَ أَوْ كَمَا قَالَ. [رواه البخاري: ٣٦٣٤]

**1511.** Usamə ibn Zeyd رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Ummu Sələmə رضي الله عنها Peyğəmbərin ﷺ yanında ikən Cəbrail onun yanına gəlib onunla söhbət etdi. O, çıxıb getdikdən sonra Peyğəmbər ﷺ Ummu Sələmədən soruşdu: “(Bilirsən) o kim idi?” Ummu Sələmə: “Bu Dihya[1] idi”- dedi. (Sonralar) Ummu Sələmə deyirdi: “Vallahi, Allahın peyğəmbərinin ﷺ xütbəsini eşidənədək, xütbədə onun Cəbrail olduğunu bildirənədək mən onun Dihya olduğunu hesab edirdim.” (əl-Buxari, 3634)

١٥١٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «رَأَيْتُ النَّاسَ مُجْتَمِعِينَ فِي صَعِيدٍ ، فَقَامَ أَبُو بَكْرٍ فَنَزَعَ ذَنُوبًا أَوْ ذَنُوبَيْنِ، وَفِي بَعْضِ نَزْعِهِ ضَعْفٌ، وَاللَّهُ يَغْفِرُ لَهُ، ثُمَّ أَخَذَهَا عُمَرُ، فَاسْتَحَالَتْ بِيَدِهِ غَرْبًا ، فَلَمْ أَرَ عَبْقَرِيًّا فِي النَّاسِ يَفْرِي فَرِيَّهُ، حَتَّى ضَرَبَ النَّاسُ بِعَطَنٍ». [رواه البخاري: ٣٦٣٣]

**1512.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən (yuxuda) camaatın bir təpə başında toplandığını gördüm. Həmin vaxt Əbu Bəkr qalxıb (su hövzəsindən) bir və ya iki çəllək su çıxartdı, suyu çıxardarkən azacıq zəiflik göstərdi. Allah onu bağışlasın! Sonra çəlləyi Ömər götürdü və bu çəllək onun əlində böyük bir badyaya döndü. Mən insanlar arasında onun qaldırdığını qaldıran bir çevik adam görmədim. Nəhayət, insanlar (heyvanlarını) suvatdan[2] çəkib (badyanın ətrafına toplandılar).” (əl-Buxari, 3633)

## ١٨ – باب:
## قَوْلُ اللَّهِ تَعَالَى: ﴿يَعْرِفُونَهُۥ كَمَا يَعْرِفُونَ أَبْنَآءَهُمْ ۖ وَإِنَّ فَرِيقًا مِّنْهُمْ لَيَكْتُمُونَ ٱلْحَقَّ وَهُمْ يَعْلَمُونَ﴾

## 18-ci fəsil.
## Uca Allahın: “Kitab verdiyimiz şəxslər onu öz oğullarını tanıdıqları kimi tanıyırlar. Həqiqətən də, onlardan bir dəstə haqqı bilə-bilə gizlədir”[3] sözü

١٥١٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ الْيَهُودَ جَاءُوا إِلَى رَسُولِ اللَّهِ ﷺ فَذَكَرُوا لَهُ أَنَّ رَجُلاً مِنْهُمْ وَامْرَأَةً زَنَيَا فَقَالَ لَهُمْ رَسُولُ اللَّهِ ﷺ: «مَا تَجِدُونَ فِي التَّوْرَاةِ فِي شَأْنِ الرَّجْمِ». فَقَالُوا نَفْضَحُهُمْ وَيُجْلَدُونَ. فَقَالَ عَبْدُ اللَّهِ

[1] Dihya ibn Xəlifə əl-Kəlbi رضي الله عنه öz gözəlliyi ilə seçilən bir əshabə idi.
[2] 1143-cü hədisin qeydlərinə bax.
[3] “əl-Bəqərə” surəsi, 146.

بْنُ سَلاَمٍ كَذَبْتُمْ، إِنَّ فِيهَا الرَّجْمَ. فَأَتَوْا بِالتَّوْرَاةِ فَنَشَرُوهَا، فَوَضَعَ أَحَدُهُمْ يَدَهُ عَلَى آيَةِ الرَّجْمِ، فَقَرَأَ مَا قَبْلَهَا وَمَا بَعْدَهَا. فَقَالَ لَهُ عَبْدُ اللَّهِ بْنُ سَلاَمٍ ارْفَعْ يَدَكَ. فَرَفَعَ يَدَهُ فَإِذَا فِيهَا آيَةُ الرَّجْمِ. فَقَالُوا صَدَقَ يَا مُحَمَّدُ، فِيهَا آيَةُ الرَّجْمِ. فَأَمَرَ بِهِمَا رَسُولُ اللَّهِ ﷺ فَرُجِمَا. [رواه البخاري: ٣٦٣٥]

**1513.** Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, (bir dəfə) yəhudilər Peyğəmbərin ﷺ yanına gəlib içərilərindən bir kişinin bir qadınla zina etdiyini ona xəbər verdilər. Peyğəmbər ﷺ onlardan soruşdu: "Tövratdan daşqalağa aid nə bilirsiniz?" Onlar dedilər: "Biz (zinakarları hər yerdə) biabır edir, üstəlik də şallaqlayırıq." Abdullah ibn Səlam dedi: "Yalan danışdınız! Həqiqətən, Tövratda (zinakarları) daşqalaq etmək əmr olunmuşdur." Belə olduqda onlar Tövratı gətirib (onun bükülü səhifələrini) açdılar, sonra onlardan biri əlini daşqalaq ayəsinin üstünə qoydu və bu ayədən həm əvvəlki, həm də sonrakı ayələri oxudu. Abdullah ibn Səlam dedi: "Qaldır əlini!" Adam əlini qaldırdı və orada daşqalağa aid ayə olduğunu (hamı) gördü. Onda onlar dedilər: "Ey Məhəmməd, (Abdullah) düz deyir, (bu Kitabda) daşqalaq ayəsi vardır." Bundan sonra Peyğəmbərin ﷺ əmri ilə zinakarları daşqalaq etdilər. (əl-Buxari, 3635)

## 19-cu fəsil. Müşriklərin Peyğəmbərdən ﷺ möcüzə göstərməyini tələb etməsi və onun onlara ayın parçalanmasını göstərməsi

## ١٩– باب: سُؤَالُ الْمُشْرِكِينَ أَنْ يُرِيَهُمُ النَّبِيُّ ﷺ آيَةً فَأَرَاهُمُ انْشِقَاقَ الْقَمَرِ

١٥١٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﵁ قَالَ انْشَقَّ الْقَمَرُ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ شِقَّتَيْنِ فَقَالَ النَّبِيُّ ﷺ: «اشْهَدُوا». [رواه البخاري: ٣٦٣٦]

**1514.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﵁ demişdir: "Peyğəmbərin ﷺ zamanında ay iki yerə bölündü və Peyğəmbər ﷺ: "(Buna) şahid olun!"– deyə buyurdu." (əl-Buxari, 3636)

١٥١٥ – عَنْ عُرْوَةَ الْبَارِقِيِّ ﵁ أَنَّ النَّبِيَّ ﷺ أَعْطَاهُ دِينَارًا يَشْتَرِي بِهِ شَاةً، فَاشْتَرَى لَهُ بِهِ شَاتَيْنِ، فَبَاعَ إِحْدَاهُمَا بِدِينَارٍ وَجَاءَهُ بِدِينَارٍ وَشَاةٍ، فَدَعَا لَهُ بِالْبَرَكَةِ فِي بَيْعِهِ، وَكَانَ لَوِ اشْتَرَى التُّرَابَ لَرَبِحَ فِيهِ. [رواه البخاري: ٣٦٤٢]

**1515.** Urva əl-Bariqidən ﵁ rəvayət edilir ki, (bir dəfə) Peyğəmbər ﷺ ona bir dinar verib bu pula bir qoç almağı tapşırdı. O da həmin pula iki qoç aldı, sonra da qoçlardan birini bir dinara satdı. O (aldığı) qoçu və dinarı gətirib Peyğəmbərə ﷺ verdikdə Peyğəmbər ﷺ onun alverinə xeyir-dua verdi.

(O vaxtdan bəri Urva) torpaq alsaydı belə, ondan da qazanc əldə edirdi. (əl-Buxari, 3642)

# ٦٢ – كِتَابُ فَضَائِلِ أَصْحَابِ النَّبِيِّ ﷺ

# 18 – Peyğəmbərin ﷺ əshabələrinin üstünlükləri kitabı

## وَمَنْ صَحِبَ النَّبِيَّ ﷺ أَوْ رَآهُ مِنَ الْمُسْلِمِينَ فَهُوَ مِنْ أَصْحَابِهِ

## Peyğəmbərin ﷺ yanında olmuş və onu görmüş müsəlmanlar onun əshabələridir

### ١ – باب: فَضْلُ أَبِي بَكْرٍ رضي الله عنه

### 1-ci fəsil. Əbu Bəkrin ﷺ üstünlükləri

١٥١٦ – عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ رضي الله عنه قَالَ: أَتَتِ امْرَأَةٌ النَّبِيَّ ﷺ فَأَمَرَهَا أَنْ تَرْجِعَ إِلَيْهِ. قَالَتْ أَرَأَيْتَ إِنْ جِئْتُ وَلَمْ أَجِدْكَ كَأَنَّهَا تَقُولُ الْمَوْتَ. قَالَ ﷺ: «إِنْ لَمْ تَجِدِينِي فَأْتِي أَبَا بَكْرٍ». [رواه البخاري: ٣٦٥٩]

**1516.** Rəvayət edilir ki, Cubeyr ibn Mutim ﷺ demişdir: "(Bir dəfə) bir qadın Peyğəmbərin ﷺ yanına gəldi və o, qadına (bir müddətdən sonra) gəlməyi buyurdu. Qadın: "Bəs gəlib səni tapmasam necə olsun?"– deyə soruşdu. Sanki o, Peyğəmbərin ﷺ vəfat edəcəyini qəsd edirdi. Peyğəmbər ﷺ buyurdu: "Məni tapmasan, Əbu Bəkrin yanına gedərsən!" (əl-Buxari, 3659)

١٥١٧ – عَنْ عَمَّارٍ رضي الله عنه قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ وَمَا مَعَهُ إِلاَّ خَمْسَةُ أَعْبُدٍ وَامْرَأَتَانِ وَأَبُو بَكْرٍ. [رواه البخاري: ٣٦٦٠]

**1517.** Rəvayət edilir ki, Əmmar ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ yanında ancaq beş kölə, iki qadın və Əbu Bəkri görmüşdüm.[1]" (əl-Buxari, 3660)

١٥١٨ – عَنْ أَبِي الدَّرْدَاءِ رضي الله عنه قَالَ: كُنْتُ جَالِسًا عِنْدَ النَّبِيِّ ﷺ إِذْ أَقْبَلَ أَبُو بَكْرٍ آخِذًا بِطَرَفِ ثَوْبِهِ حَتَّى أَبْدَى عَنْ رُكْبَتِهِ، فَقَالَ النَّبِيُّ ﷺ: «أَمَّا صَاحِبُكُمْ فَقَدْ غَامَرَ». فَسَلَّمَ، وَقَالَ إِنِّي كَانَ بَيْنِي وَبَيْنَ ابْنِ الْخَطَّابِ شَيْءٌ فَأَسْرَعْتُ إِلَيْهِ ثُمَّ نَدِمْتُ، فَسَأَلْتُهُ أَنْ يَغْفِرَ لِي فَأَبَى عَلَيَّ، فَأَقْبَلْتُ إِلَيْكَ فَقَالَ: «يَغْفِرُ اللَّهُ لَكَ يَا أَبَا بَكْرٍ». ثَلاَثًا، ثُمَّ إِنَّ عُمَرَ نَدِمَ فَأَتَى مَنْزِلَ أَبِي بَكْرٍ فَسَأَلَ أَثَمَّ أَبُو بَكْرٍ فَقَالُوا لاَ. فَأَتَى إِلَى النَّبِيِّ ﷺ، فَسَلَّمَ فَجَعَلَ وَجْهُ النَّبِيِّ ﷺ يَتَمَعَّرُ حَتَّى أَشْفَقَ أَبُو بَكْرٍ، فَجَثَا عَلَى رُكْبَتَيْهِ فَقَالَ يَا رَسُولَ اللَّهِ، وَاللَّهِ أَنَا كُنْتُ أَظْلَمَ مَرَّتَيْنِ. فَقَالَ النَّبِيُّ ﷺ: «إِنَّ اللَّهَ بَعَثَنِي إِلَيْكُمْ فَقُلْتُمْ كَذَبْتَ. وَقَالَ أَبُو بَكْرٍ صَدَقَ. وَوَاسَانِي بِنَفْسِهِ وَمَالِهِ، فَهَلْ أَنْتُمْ تَارِكُو لِي صَاحِبِي». مَرَّتَيْنِ فَمَا أُوذِيَ بَعْدَهَا. [رواه البخاري: ٣٦٦١]

**1518.** Rəvayət edilir ki, Əbu Dərda ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərin ﷺ yanında oturmuşdum. Bu vaxt Əbu Bəkr paltarının ətəyini dizindən yuxarı qaldırmış halda Peyğəmbərin ﷺ yanına gəldi. Peyğəmbər ﷺ dedi: "Dostunuza gəlincə, o (kiminləsə) mübahisə edib." (Əbu Bəkr) salam verdi və dedi: "Mənimlə (Ömər) ibn Xəttabın arasına mübahisə düşdü və mən onunla kobud danışdım. Sonra peşman oldum və ondan üzr dilədim, lakin o məni bağışlamadı. Odur ki, sənin yanına gəldim. Peyğəmbər ﷺ üç dəfə dedi: "Allah səni bağışlasın, ey Əbu Bəkr!" Sonra Ömər (öz hərəkətindən) peşman oldu

[1] Burada Əmmar ibn Yasir ﷺ İslamın əvvəlki vaxtını nəzərdə tutur. Belə ki, həmin vaxt Peyğəmbərin ﷺ dəvətini çox az adam qəbul etmişdi.

və Əbu Bəkrin evinə gəlib: “Əbu Bəkr evdədirmi?”– deyə soruşdu. Ona: “Xeyr!”– dedilər. Sonra o, Peyğəmbərin ﷺ yanına gəlib salam verdi. Əbu Bəkr Peyğəmbərin ﷺ üzündə narazılıq hissini görəndə (Ömərə) yazığı gəldi və diz çöküb iki dəfə dedi: “Ya Rəsulullah, mən daha çox haqsızlıq etmişəm!” Peyğəmbər ﷺ buyurdu: “Həqiqətən, Allah məni peyğəmbər göndərdi. Siz: “Sən yalan danışırsan”– dediniz. Əbu Bəkr isə: “O doğru danışır!”– dedi, üstəlik canı və malı ilə məni dəstəklədi. Siz mənim dostumun (xətrinə dəyməyə) son qoymayacaqsınızmı?!” (O bunu) iki dəfə təkrar etdi. (Bu hadisədən) sonra onun xətrinə dəyən olmadı. (əl-Buxari, 3661)

١٥١٩ – عَنْ عَمْرِو بْنِ الْعَاصِ ﷺ أَنَّ النَّبِيَّ ﷺ بَعَثَهُ عَلَى جَيْشِ ذَاتِ السَّلاَسِلِ، فَأَتَيْتُهُ فَقُلْتُ أَيُّ النَّاسِ أَحَبُّ إِلَيْكَ قَالَ :«عَائِشَةُ». فَقُلْتُ مِنَ الرِّجَالِ فَقَالَ: «أَبُوهَا». قُلْتُ ثُمَّ مَنْ قَالَ: «ثُمَّ عُمَرُ بْنُ الْخَطَّابِ». فَعَدَّ رِجَالاً. [رواه البخاري: ٣٦٦٢]

**1519.** Amr ibn əl-As ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ onu zatus-Səlasil ordusuna başçı təyin edib döyüşə göndərdi. (Amr dedi:) “Mən Peyğəmbərin ﷺ yanına gəlib soruşdum: “Sənin ən çox sevdiyin adam kimdir?” O: “Aişədir”– dedi. Dedim: “Bəs kişilərdən kimdir?” Dedi: “Atası!” Soruşdum: “Sonra kim?” O: “Ömər ibn Xəttabdır”– dedi və (başqa) bir neçə adamın adını çəkdi. (əl-Buxari, 3662)

١٥٢٠ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ جَرَّ ثَوْبَهُ خُيَلاَءَ لَمْ يَنْظُرِ اللَّهُ إِلَيْهِ يَوْمَ الْقِيَامَةِ». فَقَالَ أَبُو بَكْرٍ إِنَّ أَحَدَ شِقَّيْ ثَوْبِي يَسْتَرْخِي إِلاَّ أَنْ أَتَعَاهَدَ ذَلِكَ مِنْهُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّكَ لَسْتَ تَصْنَعُ ذَلِكَ خُيَلاَءَ». [رواه البخاري: ٣٦٦٥]

**1520.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim təkəbbürlüyündən paltarının ətəyini yerlə sürüyərsə, Qiyamət günü Allah onun üzünə baxmaz. (Bunu eşidəndə) Əbu Bəkr dedi: “Mən fikir vermədikdə paltarımın uclarından biri yerə sürtülür. Peyğəmbər ﷺ buyurdu: “Sən ki bunu təkəbbürlüyündən etmirsən.” (əl-Buxari, 3665)

١٥٢١ – عَنْ أَبِي مُوسَى الأَشْعَرِيِّ ﷺ أَنَّهُ تَوَضَّأَ فِي بَيْتِهِ ثُمَّ خَرَجَ، فَقُلْتُ لأَلْزَمَنَّ رَسُولَ اللَّهِ ﷺ، وَلأَكُونَنَّ مَعَهُ يَوْمِي هَذَا. قَالَ فَجَاءَ الْمَسْجِدَ، فَسَأَلَ عَنِ النَّبِيِّ ﷺ فَقَالُوا خَرَجَ وَوَجَّهَ هَا هُنَا، فَخَرَجْتُ عَلَى إِثْرِهِ أَسْأَلُ عَنْهُ، حَتَّى دَخَلَ بِئْرَ أَرِيسٍ، فَجَلَسْتُ عِنْدَ الْبَابِ، وَبَابُهَا مِنْ جَرِيدٍ حَتَّى قَضَى رَسُولُ اللَّهِ ﷺ حَاجَتَهُ، فَتَوَضَّأَ فَقُمْتُ إِلَيْهِ، فَإِذَا هُوَ جَالِسٌ عَلَى بِئْرِ أَرِيسٍ، وَتَوَسَّطَ قُفَّهَا، وَكَشَفَ عَنْ سَاقَيْهِ وَدَلاَّهُمَا فِي الْبِئْرِ، فَسَلَّمْتُ عَلَيْهِ ثُمَّ انْصَرَفْتُ، فَجَلَسْتُ عِنْدَ الْبَابِ، فَقُلْتُ لأَكُونَنَّ بَوَّابَ رَسُولِ اللَّهِ ﷺ الْيَوْمَ، فَجَاءَ أَبُو بَكْرٍ فَدَفَعَ الْبَابَ. فَقُلْتُ مَنْ هَذَا فَقَالَ أَبُو بَكْرٍ. فَقُلْتُ عَلَى رِسْلِكَ. ثُمَّ ذَهَبْتُ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ هَذَا أَبُو بَكْرٍ يَسْتَأْذِنُ. فَقَالَ: «ائْذَنْ لَهُ وَبَشِّرْهُ بِالْجَنَّةِ». فَأَقْبَلْتُ حَتَّى قُلْتُ لأَبِي بَكْرٍ ادْخُلْ، وَرَسُولُ اللَّهِ ﷺ يُبَشِّرُكَ بِالْجَنَّةِ. فَدَخَلَ أَبُو بَكْرٍ فَجَلَسَ عَنْ يَمِينِ رَسُولِ اللَّهِ ﷺ مَعَهُ فِي الْقُفِّ، وَدَلَّى رِجْلَيْهِ فِي الْبِئْرِ، كَمَا صَنَعَ النَّبِيُّ ﷺ، وَكَشَفَ عَنْ سَاقَيْهِ، ثُمَّ رَجَعْتُ فَجَلَسْتُ وَقَدْ تَرَكْتُ أَخِي يَتَوَضَّأُ وَيَلْحَقُنِي، فَقُلْتُ إِنْ يُرِدِ اللَّهُ بِفُلاَنٍ خَيْرًا – يُرِيدُ أَخَاهُ – يَأْتِ بِهِ. فَإِذَا إِنْسَانٌ يُحَرِّكُ الْبَابَ. فَقُلْتُ مَنْ هَذَا فَقَالَ عُمَرُ بْنُ الْخَطَّابِ. فَقُلْتُ عَلَى رِسْلِكَ. ثُمَّ جِئْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَسَلَّمْتُ عَلَيْهِ، فَقُلْتُ هَذَا عُمَرُ بْنُ الْخَطَّابِ يَسْتَأْذِنُ. فَقَالَ:

«ائذَنْ لَهُ وَبَشِّرْهُ بِالْجَنَّة». فَجِئتُ فَقُلْتُ ادْخُلْ وَبَشَّرَكَ رَسُولُ اللَّه ﷺ بِالْجَنَّة. فَدَخَلَ، فَجَلَسَ مَعَ رَسُولِ اللَّه ﷺ فِي الْقُفِّ عَنْ يَسَارِه، وَدَلَّى رِجْلَيْه فِي الْبِئْر، ثُمَّ رَجَعْتُ فَجَلَسْتُ، فَقُلْتُ إِنْ يُرِد اللَّهُ بِفُلَانٍ خَيْرًا يَأْتِ بِه. فَجَاءَ إِنْسَانٌ يُحَرِّكُ الْبَابَ، فَقُلْتُ مَنْ هَذَا فَقَالَ عُثْمَانُ بْنُ عَفَّانَ. فَقُلْتُ عَلَى رِسْلِكَ. فَجِئتُ إِلَى رَسُولِ اللَّه ﷺ فَأَخْبَرْتُهُ. فَقَالَ: «ائذَنْ لَهُ وَبَشِّرْهُ بِالْجَنَّة عَلَى بَلْوَى تُصِيبُهُ» فَجِئتُهُ فَقُلْتُ لَهُ ادْخُلْ وَبَشَّرَكَ رَسُولُ اللَّه ﷺ بِالْجَنَّة عَلَى بَلْوَى تُصِيبُكَ. فَدَخَلَ فَوَجَدَ الْقُفَّ قَدْ مُلِئَ، فَجَلَسَ وُجَاهَهُ مِنَ الشِّقِّ الآخَر.
[رواه البخاري: ٣٦٧٤]

**1521.** Rəvayət edilir ki, Əbu Musa əl-Əşari ﷺ demişdir: "(Bir dəfə) mən dəstəmaz alıb evdən çıxdım və (öz-özümə) dedim: "Peyğəmbərdən ﷺ ayrılmayacağam, bütün günü onun yanında olacağam."

Sonra Əbu Musa məscidə gəlib Peyğəmbəri ﷺ soruşdu. (Oradakılar ona) dedilər: "Filan yerə getdi."

(Əbu Musa) dedi: "Mən soruşa-soruşa onun dalınca çıxdım. Nəhayət, o gedib Əris quyusu olan bağçaya girdi. Mən də gəlib qapının yanında oturdum. Bağcanın qapısı xurma budaqlarından düzəldilmişdi. Nəhayət, Peyğəmbər ﷺ təbii ehtiyacını rəf etdikdən sonra dəstəmaz aldı. Bundan sonra mən onun yanına getdim və gördüm ki, o, quyunun başında oturub, ayaqlarını da (dizdən yuxarıya qədər) açıb quyuya sallayıb. Mən ona salam verdim, sonra da gedib qapının yanında oturdum və (öz-özümə) dedim: "Bu gün mən Peyğəmbərin ﷺ qapıçısı olaçağam." (Bu əsnada) Əbu Bəkr gəlib qapını döydü. Mən: "Kimdir o?"– deyə soruşdum. O: "Əbu Bəkrdir!"– deyə cavab verdi. Mən (ona): "Yerində dur"– dedim, sonra (Peyğəmbərin ﷺ yanına) gedib dedim: "Ya Rəsulullah, Əbu Bəkr içəri daxil olmaq üçün izn istəyir." Peyğəmbər ﷺ buyurdu: "İzn ver gəlsin və onu Cənnətlə müjdələ!" Mən qayıdıb Əbu Bəkrə dedim: "Gəl içəri! Allahın Elçisi ﷺ səni Cənnətlə müjdələyir!" Əbu Bəkr içəri daxil olub quyunun başında, Peyğəmbərin ﷺ sağ tərəfində oturdu və Peyğəmbər ﷺ etdiyi kimi ayaqlarını açıb quyuya salladı. Sonra mən (yerimə) qayıdıb (qapının yanında) oturdum. (Doğma) qardaşıma gəlincə, o da mənimlə gəlmək istəyirdi, lakin mən onu dəstəmaz alarkən qoyub getdim. Allah ona xeyir nəsib etmək istəsə, onu da bura gətirər. Elə bu vaxt kimsə qapını itələdi. Mən: "Kimdir o?"– deyə soruşdum. O: "Ömər ibn Xəttabdır!"– deyə cavab verdi. Mən (ona): "Yerində dur"– dedim, sonra Peyğəmbərin ﷺ yanına gedib ona salam verdim və dedim: "Ömər ibn Xəttab içəri girmək üçün izn istəyir." Peyğəmbər ﷺ buyurdu: "İzn ver gəlsin və onu Cənnətlə müjdələ!" Mən qayıdıb (Ömərə) dedim: "Gəl içəri! Allahın Elçisi ﷺ səni Cənnətlə müjdələdi!" Ömər içəri daxil olub quyunun başında, Peyğəmbərin ﷺ sol tərəfində oturdu və ayaqlarını açıb quyuya salladı. Sonra mən qayıdıb (qapının yanında) oturdum. Əgər Allah filankəsə[1] xeyir nəsib etmək istəsə, onu da bura gətirər. Bu vaxt bir nəfər gəlib qapını tərpətdi. Mən: "Kimdir o?"– deyə soruşdum. O: "Osman ibn Əffandır!"– deyə cavab verdi. Mən (ona): "Yerində dur"– dedim, sonra Peyğəmbərin ﷺ yanına gedib (Osmanın ﷺ gəldiyini) ona xəbər verdim. Peyğəmbər ﷺ buyurdu: "İzn ver gəlsin və ona müjdə ver ki, onun başına müsibət gəldikdən sonra Cənnətə girəcəkdir!" Mən qayıdıb (Osmana) dedim: "Gəl içəri! Allahın Elçisi ﷺ sənə müj-

[1] Əbu Musa ﷺ qardaşını qəsd edirdi.

də verir ki, sənin başına müsibət gəldikdən sonra sən Cənnətə girəcəksən." Osman içəri daxil oldu və quyunun kənarında yer olmadığını görüb Peyğəmbərin ﷺ qarşı tərəfində oturdu." (əl-Buxari, 3674)

١٥٢٢ – عَنْ أَبِى سَعِيد الْخُدْرِىِّ ﵁ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «لاَ تَسُبُّوا أَصْحَابِى، فَلَوْ أَنَّ أَحَدَكُمْ أَنْفَقَ مِثْلَ أُحُدٍ ذَهَبًا مَا بَلَغَ مُدَّ أَحَدِهِمْ وَلاَ نَصِيفَهُ». [رواه البخاري: ٣٦٧٣]

**1522.** Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim əshabələrimi söyməyin! Əgər sizdən biriniz Uhud dağı boyda qızıl sədəqə versə, onlardan birinin verdiyi bir ovuc sədəqəyə, hətta yarısına belə çata bilməz" (əl-Buxari, 3673)

١٥٢٣ – عَنْ أَنَسِ بْنِ مَالِك ﵁، أَنَّ النَّبِىَّ ﷺ صَعِدَ أُحُدًا وَأَبُو بَكْرٍ وَعُمَرُ وَعُثْمَانُ فَرَجَفَ بِهِمْ فَقَالَ: «اثْبُتْ أُحُدُ فَإِنَّمَا عَلَيْكَ نَبِىٌّ وَصِدِّيقٌ وَشَهِيدَانِ». [رواه البخاري: ٣٦٧٥]

**1523.** Ənəs ﵁ rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ, Əbu Bəkr, Ömər və Osman Uhud dağına qalxdılar və dağ silkələndi. Onda Peyğəmbər ﷺ buyurdu: "Sakit dur, ey Uhud! Həqiqətən, sənin üstündə bir peyğəmbər, bir siddiq və iki şəhid var." (əl-Buxari, 3675)

١٥٢٤ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ: إِنِّى لَوَاقِفٌ فِى قَوْمٍ، فَدَعَوُا اللَّهَ لِعُمَرَ بْنِ الْخَطَّابِ وَقَدْ وُضِعَ عَلَى سَرِيرِهِ، إِذَا رَجُلٌ مِنْ خَلْفِى قَدْ وَضَعَ مِرْفَقَهُ عَلَى مَنْكِبِى، يَقُولُ رَحِمَكَ اللَّهُ، إِنْ كُنْتُ لأَرْجُو أَنْ يَجْعَلَكَ اللَّهُ مَعَ صَاحِبَيْكَ، لأَنِّى كَثِيرًا مِمَّا كُنْتُ أَسْمَعُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ كُنْتُ وَأَبُو بَكْرٍ وَعُمَرُ، وَفَعَلْتُ وَأَبُو بَكْرٍ وَعُمَرُ، وَانْطَلَقْتُ وَأَبُو بَكْرٍ وَعُمَرُ. فَإِنْ كُنْتُ لأَرْجُو أَنْ يَجْعَلَكَ اللَّهُ مَعَهُمَا. فَالْتَفَتُّ فَإِذَا هُوَ عَلِىُّ بْنُ أَبِى طَالِبٍ ﵁. [رواه البخاري: ٣٦٧٧]

**1524.** Rəvayət edilir ki, ibn Abbas ﵄ demişdir: "Ömər ibn Xəttab ölüm ayağında ikən mən onun yanına yığışıb ona dua edənlərin arasında idim. Birdən bir nəfərin arxamda durub, dirsəyini çiynimə qoyub belə dediyini eşitdim: "Allah sənə rəhmət eləsin. Mən həmişə arzulamışam ki, sən dostlarınla[1] bir yerdə olasan. Çünki mən Peyğəmbərin ﷺ çox vaxt belə dediyini eşidərdim: "Mən, Əbu Bəkr və Ömərlə (filan yerdə) idim. Mən, Əbu Bəkr və Ömərlə (filan işi) gördüm. Mən, Əbu Bəkr və Ömərlə (filan yerə) getdim." Mən ümid edirdim ki, Allah səni onlara qovuşduracaq."

İbn Abbas ﵄ dedi: "Mən dönüb gördüm ki, bu, Əli ibn Əbu Talibdir." (əl-Buxari, 3677)

## 2-ci fəsil. Ömər ibn Xəttabın ﵁ tərifəlayiq xüsusiyyətləri

## ٢– باب: مَنَاقِبُ عُمَرَ بْنِ الْخَطَّابِ ﵁

١٥٢٥ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵄ قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «رَأَيْتُنِى دَخَلْتُ الْجَنَّةَ، فَإِذَا أَنَا بِالرُّمَيْصَاءِ امْرَأَةِ أَبِى طَلْحَةَ وَسَمِعْتُ خَشَفَةً، فَقُلْتُ مَنْ هَذَا فَقَالَ هَذَا بِلاَلٌ. وَرَأَيْتُ قَصْرًا بِفِنَائِهِ جَارِيَةٌ، فَقُلْتُ لِمَنْ هَذَا فَقَالَ لِعُمَرَ.

[1] Burada o, Peyğəmbəri ﷺ və Əbu Bəkr ﵁ qəsd edirdi.

فَأَرَدْتُ أَنْ أَدْخُلَهُ فَأَنْظُرَ إِلَيْهِ، فَذَكَرْتُ غَيْرَتَكَ». فَقَالَ عُمَرُ بِأُمِّي وَأَبِي يَا رَسُولَ اللَّهِ أَعَلَيْكَ أَغَارُ. [رواه البخاري: ٣٦٧٩]

**1525.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Yuxuda) gördüm ki, Cənnətdəyəm. Birdən qarşımda Əbu Təlhənin zövcəsi Rumeysanı gördüm və bir ayaq səsi eşitdim. Soruşdum: "Bu kimdir?" Dedilər: "Bu Bilaldır!" Sonra mən bir qəsr və bu qəsrin həyətində bir cavan qız gördüm. Soruşdum: "Bu (qəsr) kimindir?" Dedilər: "Ömərindir!" Mən qəsrin içinə girib ora göz gəzdirmək istədim, lakin sənin qısqanclığın yadıma düşdü (və mən dönüb oradan uzaqlaşdım)." (Bunu eşidəndə) Ömər dedi: "Atam-anam sənə qurban, ya Rəsulullah, heç sənə qısqana bilərəmmi?!" (əl-Buxari, 3679)

١٥٢٦ – عَنْ أَنَسٍ ﷺ أَنَّ رَجُلاً سَأَلَ النَّبِيَّ ﷺ عَنِ السَّاعَةِ، فَقَالَ مَتَى السَّاعَةُ قَالَ: «وَمَاذَا أَعْدَدْتَ لَهَا». قَالَ لاَ شَيْءَ إِلاَّ أَنِّي أُحِبُّ اللَّهَ وَرَسُولَهُ ﷺ. فَقَالَ: «أَنْتَ مَعَ مَنْ أَحْبَبْتَ». قَالَ أَنَسٌ فَمَا فَرِحْنَا بِشَيْءٍ فَرَحَنَا بِقَوْلِ النَّبِيِّ ﷺ: «أَنْتَ مَعَ مَنْ أَحْبَبْتَ». قَالَ أَنَسٌ فَأَنَا أُحِبُّ النَّبِيَّ ﷺ وَأَبَا بَكْرٍ وَعُمَرَ، وَأَرْجُو أَنْ أَكُونَ مَعَهُمْ بِحُبِّي إِيَّاهُمْ، وَإِنْ لَمْ أَعْمَلْ بِمِثْلِ أَعْمَالِهِمْ. [رواه البخاري: ٣٦٨٨]

**1526.** Ənəs ﷺ rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərdən ﷺ Qiyamət barəsində soruşub dedi: "Qiyamət Saatı nə zaman gələcək?" Peyğəmbər ﷺ buyurdu: "Sən Qiyamətə nə tədarük görmüsən?" Adam dedi: "Heç bir şey hazırlamamışam, mən sadəcə Allahı və onun Rəsulunu sevirəm." Peyğəmbər ﷺ buyurdu: "Sən sevdiyin kəslə bir yerdə olacaqsan!"

Ənəs dedi: "Biz Peyğəmbərin ﷺ: "Sən sevdiyin kəslə bir yerdə olacaqsan!" sözünə sevindiyimiz kimi heç bir şeyə sevinməmişdik."

Ənəs dedi: "Mən Peyğəmbəri ﷺ, Əbu Bəkri, Öməri sevirəm və ümid edirəm ki, onlar qədər yaxşılıq etmiş olmasam belə, bu sevgimə görə onlarla bir yerdə olacağam." (əl-Buxari, 3688)

١٥٢٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «لَقَدْ كَانَ فِيمَنْ كَانَ قَبْلَكُمْ مِنْ بَنِي إِسْرَائِيلَ رِجَالٌ يُكَلَّمُونَ مِنْ غَيْرِ أَنْ يَكُونُوا أَنْبِيَاءَ، فَإِنْ يَكُنْ مِنْ أُمَّتِي مِنْهُمْ أَحَدٌ فَعُمَرُ». [رواه البخاري: ٣٦٨٩]

**1527.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən əvvəl yaşamış İsrail oğullarından – peyğəmbərlər istisna olmaqla, bəzi (əməlisaleh) insanlara vəhy nazil olardı. Əgər mənim ümmətimdən kiməsə vəhy nazil olmuş olsaydı, bu, Ömər olardı." (əl-Buxari, 3689)

## 3-cü fəsil. Osman ibn Əffanın ﷺ tərifəlayiq xüsusiyyətləri

## ٣– باب: مَنَاقِبُ عُثْمَانَ بْنِ عَفَّانَ ﷺ

١٥٢٨ – عَنِ ابْنِ عُمَرَ ﷺ أَنَّهُ جَاءَ رَجُلٌ مِنْ أَهْلِ مِصْرَ فَقَالَ لَهُ: إِنِّي سَائِلُكَ عَنْ شَيْءٍ فَحَدِّثْنِي هَلْ تَعْلَمُ أَنَّ عُثْمَانَ فَرَّ يَوْمَ أُحُدٍ قَالَ نَعَمْ. قَالَ تَعْلَمُ أَنَّهُ تَغَيَّبَ عَنْ بَدْرٍ وَلَمْ يَشْهَدْ قَالَ نَعَمْ. قَالَ تَعْلَمُ أَنَّهُ تَغَيَّبَ عَنْ بَيْعَةِ الرُّضْوَانِ فَلَمْ يَشْهَدْهَا قَالَ نَعَمْ. قَالَ اللَّهُ أَكْبَرُ. قَالَ ابْنُ عُمَرَ تَعَالَ أُبَيِّنْ لَكَ أَمَّا فِرَارُهُ يَوْمَ أُحُدٍ فَأَشْهَدُ أَنَّ اللَّهَ عَفَا عَنْهُ وَغَفَرَ لَهُ، وَأَمَّا تَغَيُّبُهُ عَنْ بَدْرٍ، فَإِنَّهُ كَانَتْ تَحْتَهُ بِنْتُ رَسُولِ اللَّهِ ﷺ وَكَانَتْ مَرِيضَةً، فَقَالَ لَهُ رَسُولُ

اللَّه ﷺ: «إِنَّ لَكَ أَجْرَ رَجُلٍ مِمَّنْ شَهِدَ بَدْرًا وَسَهْمَهُ». وَأَمَّا تَغَيُّبُهُ عَنْ بَيْعَةِ الرُّضْوَانِ فَلَوْ كَانَ أَحَدٌ أَعَزَّ بِبَطْنِ مَكَّةَ مِنْ عُثْمَانَ لَبَعَثَهُ مَكَانَهُ فَبَعَثَ رَسُولُ اللَّهِ ﷺ عُثْمَانَ وَكَانَتْ بَيْعَةُ الرُّضْوَانِ بَعْدَ مَا ذَهَبَ عُثْمَانُ إِلَى مَكَّةَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ بِيَدِهِ الْيُمْنَى «هَذِهِ يَدُ عُثْمَانَ». فَضَرَبَ بِهَا عَلَى يَدِهِ، فَقَالَ: «هَذِهِ لِعُثْمَانَ». فَقَالَ لَهُ ابْنُ عُمَرَ اذْهَبْ بِهَا الآنَ مَعَكَ. [رواه البخاري: ٣٦٩٨]

**1528.** Rəvayət edilir ki, (bir dəfə) Misirdən olan birisi Abdullah ibn Ömərin ﷺ yanına gəlib ona dedi: “Səndən (bəzi) şeylər haqqında soruşmaq istəyirəm. De görüm, sən Osmanın Uhud döyüşündən yayındığını bilirsənmi?” (İbn Ömər): “Bəli!”– dedi. Adam soruşdu: “Osmanın Bədr döyüşündən yayındığını, döyüşdə iştirak etmədiyini bilirsənmi?” (İbn Ömər): “Bəli!”– dedi. Adam (yenə) soruşdu: “Osmanın Ridvan beyətindən[1] yayındığını, orada iştirak etmədiyini bilirsənmi?” (İbn Ömər): “Bəli!”– dedi. Adam: “Allahu Əkbər!”– dedi (və çıxıb getmək istədi). İbn Ömər dedi: “Yaxın gəl, sənə başa salım! Osmanın Uhud döyüşündən yayındığına gəlincə, mən şahidlik edirəm ki, Allah onu əfv etmiş və onu bağışlamışdır[2]. Onun Bədr döyüşündə iştirak etmədiyinə gəldikdə isə, (biləsən ki, o zaman) Peyğəmbərin ﷺ qızı onun nikahı altında idi və qadın (bərk) xəstələnmişdi. Onda Peyğəmbər ﷺ ona buyurdu: “Sənə Bədrdə iştirak edən bir kişinin savabı, üstəlik onun payı qədər (sənə də qənimətdən) pay çatacaq.” Qaldı ki onun Ridvan beyətindən yayınmağına, (bil ki,) əgər Məkkədə Osmandan daha əziz adam (məkkəlilərin hörmət etdiyi başqa birisi) olsaydı, Peyğəmbər ﷺ Osmanın yerinə onu göndərərdi. Lakin Peyğəmbər ﷺ Osmanı göndərdi və Ridvan beyəti Osman Məkkəyə getdikdən sonra həyata keçirildi. Onda Peyğəmbər ﷺ sağ əlini qaldırıb buyurdu: “Bu, Osmanın əlidir!” Sonra onu sol əlinin üstünə qoyub dedi: “Bu, Osmanın (beyətidir)!” Bundan sonra ibn Ömər dedi: “İndi isə get və mənim dediklərimi yadından çıxartma!” (əl-Buxari, 3698)

## 4-cü fəsil. Əli ibn Əbu Talibin ﷺ tərifəlayiq xüsusiyyətləri

## ٤– باب: مَنَاقِبُ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ ﷺ

١٥٢٩ – عَنْ عَلِيٍّ ﷺ أَنَّ فَاطِمَةَ عليها السلام شَكَتْ مَا تَلْقَى مِنْ أَثَرِ الرَّحَا، فَأَتَى النَّبِيَّ ﷺ سَبْيٌ، فَانْطَلَقَتْ فَلَمْ تَجِدْهُ، فَوَجَدَتْ عَائِشَةَ، فَأَخْبَرَتْهَا، فَلَمَّا جَاءَ النَّبِيُّ ﷺ أَخْبَرَتْهُ عَائِشَةُ بِمَجِيءِ فَاطِمَةَ، فَجَاءَ النَّبِيُّ ﷺ إِلَيْنَا، وَقَدْ أَخَذْنَا مَضَاجِعَنَا، فَذَهَبْتُ لأَقُومَ فَقَالَ: «عَلَى مَكَانِكُمَا». فَقَعَدَ بَيْنَنَا حَتَّى وَجَدْتُ بَرْدَ قَدَمَيْهِ عَلَى صَدْرِي وَقَالَ: «أَلاَ أُعَلِّمُكُمَا خَيْرًا مِمَّا سَأَلْتُمَانِي إِذَا أَخَذْتُمَا مَضَاجِعَكُمَا تُكَبِّرَا أَرْبَعًا وَثَلاَثِينَ، وَتُسَبِّحَا ثَلاَثًا وَثَلاَثِينَ، وَتَحْمَدَا ثَلاَثَةً وَثَلاَثِينَ، فَهْوَ خَيْرٌ لَكُمَا مِنْ خَادِمٍ». [رواه البخاري: ٣٧٠٥]

**1529.** Əli (ibn Əbu Talib) ﷺ rəvayət edir ki, Fatimə عليها السلام kirkirənin (onun əllərində) iz buraxdığından şikayət etdi. (Bir müddətdən sonra) Peyğəmbərə ﷺ (bir neçə) əsir gətirdilər. Fatimə (bu əsirlərdən birini özünə köməkçi götürmək məq-

[1] Burada söhbət Hudeybiyədə ağac altında olan beyətdən gedir.

[2] Uca Allah buyurur: ***“Uhudda* iki qoşun qarşılaşdığı gün içərinizdən üz döndərənləri şeytan qazandıqları bəzi günahlar üzündən səhv etməyə vadar etdi. Allah artıq onları bağışladı. Həqiqətən, Allah Bağışlayandır, Həlimdir.”** “Ali-İmran” surəsi, 155.

sədilə) Peyğəmbərin ﷺ yanına getdi, lakin onu (evdə) tapa bilmədi, Aişəni görüb (nə istədiyini) ona bildirdi. Peyğəmbər ﷺ (evə) gəldikdə Aişə ona Fatimənin gəldiyini xəbər verdi. Bundan sonra Peyğəmbər ﷺ bizə gəldi. Həmin vaxt biz artıq yatağımıza uzanmışdıq. Mən (onu görəndə) ayağa qalxmaq istədim, lakin o: "Qalxmayın!"– dedi və (gəlib) aramızda oturdu. Mən hətta onun soyuq ayaqlarının sinəmə toxunduğunu hiss etdim. O buyurdu: "Məndən istədiyinizdən daha xeyirlisini sizə öyrədimmi? Yatağınıza uzandığınız zaman otuz dörd dəfə "Allahu Əkbər", otuz üç dəfə "sübhanəllah" və otuz üç dəfə "əlhəmdulillah" deyin. Bu sizin üçün xidmətçidən daha xeyirli olar." (əl-Buxari, 3705)

## ٥– باب: مَنَاقِبُ الزُّبَيْرِ بْنِ الْعَوَّامِ ﵁

## 5-ci fəsil. Zubeyr ibn Əvvamın ﵁ tərifəlayiq xüsusiyyətləri

١٥٣٠ – عَنْ عَبْدِ اللَّهِ بْنِ الزُّبَيْرِ ﵄ قَالَ كُنْتُ يَوْمَ الأَحْزَابِ جُعِلْتُ أَنَا وَعُمَرُ بْنُ أَبِى سَلَمَةَ فِى النِّسَاءِ، فَنَظَرْتُ فَإِذَا أَنَا بِالزُّبَيْرِ عَلَى فَرَسِهِ، يَخْتَلِفُ إِلَى بَنِى قُرَيْظَةَ مَرَّتَيْنِ أَوْ ثَلاَثًا، فَلَمَّا رَجَعْتُ قُلْتُ يَا أَبَتِ، رَأَيْتُكَ تَخْتَلِفُ. قَالَ أَوَهَلْ رَأَيْتَنِى يَا بُنَىَّ قُلْتُ نَعَمْ. قَالَ كَانَ رَسُولُ اللَّهِ ﷺ قَالَ: «مَنْ يَأْتِ بَنِى قُرَيْظَةَ فَيَأْتِينِى بِخَبَرِهِمْ». فَانْطَلَقْتُ، فَلَمَّا رَجَعْتُ جَمَعَ لِى رَسُولُ اللَّهِ ﷺ أَبَوَيْهِ فَقَالَ: «فِدَاكَ أَبِى وَأُمِّى». [رواه البخاري: ٣٧٢٠]

**1530.** Rəvayət edilir ki, Abdullah ibn Zubeyr ﵄ demişdir: "Əhzab günü mən Ömər ibn Əbu Sələmə ilə birlikdə qadınların yanında idim. Bir də baxıb gördüm ki, (atam) Zubeyr atını iki və ya üç kərə Bənu-Qureyzə qəbiləsinə tərəf çapdı. (Mədinəyə) qayıtdıqda mən dedim: "Atacan, mən sənin (bir neçə dəfə Bənu-Qureyzə qəbiləsinə) gedib-gəldiyini gördüm." (Atam) soruşdu: "Doğrudan gördün, oğul bala?" Mən: "Bəli!"- deyə cavab verdim. (Atam) dedi: "Peyğəmbər ﷺ (əshabələrinə): "Kim Bənu-Qureyzəyə gedib onlar barədə mənə xəbər gətirər?"- deyə müraciət etdi. Mən də ora elə buna görə getdim. Mən oradan qayıtdıqdan sonra Peyğəmbər ﷺ ata-anasını yad edib mənə: "Atam-anam sənə qurban"- dedi." (əl-Buxari, 3720)

## ٦– باب: ذِكْرُ طَلْحَةَ بْنِ عُبَيْدِ اللَّهِ ﵁

## 6-cı fəsil. Təlhə ibn Ubeydullahın ﵁ tərifəlayiq xüsusiyyətləri

١٥٣١ – عَنْ أَبِى عُثْمَانَ ﵁ قَالَ: لَمْ يَبْقَ مَعَ النَّبِىِّ ﷺ فِى بَعْضِ تِلْكَ الأَيَّامِ الَّتِى قَاتَلَ فِيهِنَّ رَسُولُ اللَّهِ ﷺ غَيْرُ طَلْحَةَ وَسَعْدٍ. [رواه البخاري: ٣٧٢٢-٣٧٢٣]

**1531.** Rəvayət edilir ki, Əbu Osman ﵁ demişdir: "Peyğəmbər ﷺ vuruşduğu o günlərin birində[1] onun yanında Təlhədən ﵁ və Səd (ibn Əbu Vəqqasdan) başqa heç kəs qalmamışdı." (əl-Buxari, 3722-3723)

---

[1] Burada Uhud döyüşü nəzərdə tutulur.

١٥٣٢ – عَنْ قَيْسِ بْنِ أَبِى حَازِمٍ، قَالَ: رَأَيْتُ يَدَ طَلْحَةَ الَّتِى وَقَى بِهَا النَّبِىَّ ﷺ قَدْ شَلَّتْ. [رواه البخاري: ٣٧٢٤]

**1532.** Rəvayət edilir ki, Qeys ibn Əbu Hazim demişdir: "Mən Təlhənin Peyğəmbəri ﷺ qoruyan əlinin sonradan iflic olduğunu[1] gördüm." (əl-Buxari, 3724)

## 7-ci fəsil. Səd ibn Əbu Vəqqas əz-Zuhrinin ﷺ tərifəlayiq xüsusiyyətləri

## ٧– باب: مَنَاقِبُ سَعْدِ بْنِ أَبِى وَقَّاصٍ الزُّهْرِىِّ ﷺ

١٥٣٣ – عَنْ سَعْدِ بْنِ أَبِى وَقَّاصٍ ﷺ قَالَ: جَمَعَ لِى النَّبِىُّ ﷺ أَبَوَيْهِ يَوْمَ أُحُدٍ. [رواه البخاري: ٣٧٢٥]

**1533.** Rəvayət edilir ki, Səd ibn Əbu Vəqqas ﷺ demişdir: "Uhud döyüşündə Peyğəmbər ﷺ mənə: "Atam-anam sənə qurban"– demişdi." (əl-Buxari, 3725)

## 8-ci fəsil. Peyğəmbərin kürəkənləri

## ٨– باب: ذِكْرُ أَصْهَارِ النَّبِىِّ ﷺ

١٥٣٤ – عَنْ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ ﷺ قَالَ: إِنَّ عَلِيًّا خَطَبَ بِنْتَ أَبِى جَهْلٍ، فَسَمِعَتْ بِذَلِكَ فَاطِمَةُ، فَأَتَتْ رَسُولَ اللَّهِ ﷺ فَقَالَتْ يَزْعُمُ قَوْمُكَ أَنَّكَ لاَ تَغْضَبُ لِبَنَاتِكَ، هَذَا عَلِىٌّ نَاكِحٌ بِنْتَ أَبِى جَهْلٍ، فَقَامَ رَسُولُ اللَّهِ ﷺ فَسَمِعْتُهُ حِينَ تَشَهَّدَ يَقُولُ: «أَمَّا بَعْدُ أَنْكَحْتُ أَبَا الْعَاصِ بْنَ الرَّبِيعِ، فَحَدَّثَنِى وَصَدَقَنِى، وَإِنَّ فَاطِمَةَ بَضْعَةٌ مِنِّى، وَإِنِّى أَكْرَهُ أَنْ يَسُوءَهَا، وَاللَّه لاَ تَجْتَمِعُ بِنْتُ رَسُولِ اللَّهِ ﷺ وَبِنْتُ عَدُوِّ اللَّهِ عِنْدَ رَجُلٍ وَاحِدٍ». فَتَرَكَ عَلِىٌّ الْخِطْبَةَ.
وَفِي رِوَايَةٍ عَنْ الْمِسْوَرِ قَالَ: سَمِعْتُ النَّبِىَّ ﷺ وَذَكَرَ صِهْرًا لَهُ مِنْ بَنِى عَبْدِ شَمْسٍ فَأَثْنَى عَلَيْهِ فِى مُصَاهَرَتِهِ إِيَّاهُ فَأَحْسَنَ قَالَ «حَدَّثَنِى فَصَدَقَنِى، وَوَعَدَنِى فَوَفَى لِى». [رواه البخاري: ٣٧٢٩]

**1534.** Rəvayət edilir ki, Misvər ibn Məxrəmə ﷺ demişdir: "(Bir dəfə) Əli, Əbu Cəhlin qızına elçi göndərdi. Fatimə bunu eşidəndə (bərk qəzəbləndi və) Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Həmqəbilələrin deyəcəklər ki, sən öz qızlarına görə heç qəzəblənmirsən. Əli, Əbu Cəhlin qızı ilə evlənmək istəyir." Onda Peyğəmbər ﷺ ayağa qalxıb şəhadət gətirdi və buyurdu: "Sonra isə... Mən qızımı Əbul-Asa ərə verdikdə o mənə söz verdi və sözünün üstündə durdu[2]. Fatimə də mənim ciyərparəmdir. Mən istəmirəm ki, kimsə ona bir pislik etsin. Vallahi, Allahın elçisinin ﷺ qızı ilə Allahın düşmənin qızı eyni bir kişinin zövcəsi ola bilməz." (Bunu eşidəndə) Əli (o qızla) evlənmək fikrindən vaz keçdi."

Digər rəvayətdə Misvər demişdir: "Mən Peyğəmbərin ﷺ Abduşəms oğullarından olan kürəkənini yad etdiyini, onu qohumluq əlaqələrini saxlamaq xüsusunda tərifləyib belə dediyini eşitmişəm: "O, mənə söz verdi və sözünün üstündə durdu, vəd verdi və vədini yerinə yetirdi.[3]" (əl-Buxari, 3729)

[1] Əbu Təlhə ﷺ Uhud döyüşündə Peyğəmbəri ﷺ qoruyarkən əlindən yaralanmış və aldığı yaradan da onun əli iflic olmuşdur. Əshabələr Allah yolunda Peyğəmbəri ﷺ qorumaq üçün canlarından keçməyə hazır idilər.

[2] Peyğəmbər ﷺ hələ İslamdan əvvəl qızı Zeynəbi Əbul-Asa ərə vermiş və Əbul-As da ona Zeynəbdən başqa heç kəslə evlənməyəcəyinə dair söz vermişdir.

[3] Əbul-As ﷺ Bədr döyüşündə əsir düşdükdə Peyğəmbər ﷺ onu azad etmiş, o da ona Məkkəyə qayıdan kimi Zeynəbi Mədinəyə göndərəcəyinə vəd vermiş və vədini yerinə yetirmişdir.

## 9-cu fəsil. Peyğəmbərin ﷺ azad etdiyi köləsi Zeyd ibn Harisənin ؓ tərifəlayiq xüsusiyyətləri

## ٩– باب: مَنَاقِبُ زَيْدِ بْنِ حَارِثَةَ مَوْلَى النَّبِيِّ ﷺ

١٥٣٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ؆ قَالَ: بَعَثَ النَّبِيُّ ﷺ بَعْثًا، وَأَمَّرَ عَلَيْهِمْ أُسَامَةَ بْنَ زَيْدٍ، فَطَعَنَ بَعْضُ النَّاسِ فِى إِمَارَتِهِ، فَقَالَ النَّبِيُّ ﷺ: «إِنْ تَطْعُنُوا فِى إِمَارَتِهِ فَقَدْ كُنْتُمْ تَطْعُنُونَ فِى إِمَارَةِ أَبِيهِ مِنْ قَبْلُ، وَايْمُ اللَّهِ، إِنْ كَانَ لَخَلِيقًا لِلإِمَارَةِ، وَإِنْ كَانَ لَمِنْ أَحَبِّ النَّاسِ إِلَىَّ، وَإِنَّ هَذَا لَمِنْ أَحَبِّ النَّاسِ إِلَىَّ بَعْدَهُ». [رواه البخاري: ٣٧٣٠]

**1535.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ؆ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ Usamə ibn Zeydi bir qoşuna başçı təyin edib onları (döyüşə) göndərdi. Bəziləri onun əmir olmasına dil uzatdılar." Onda Peyğəmbər ﷺ buyurdu: "Sizin onun əmir olmasına dil uzatmağınız (təbiidir. Çünki) siz əvvəllər onun atasının əmir olmasına da dil uzatmışdınız. Vallahi ki, (onun atası) əmir olmağa layiq idi, həm də o, mənim ən çox sevdiyim adamlardan biri idi. Heç şübhəsiz ki, bu da ondan sonra mənim ən çox sevdiyim adamlardan biridir." (əl-Buxari, 3730)

١٥٣٦ – عَنْ عَائِشَةَ ؓ قَالَتْ: دَخَلَ عَلَىَّ قَائِفٌ وَالنَّبِيُّ ﷺ شَاهِدٌ، وَأُسَامَةُ بْنُ زَيْدٍ وَزَيْدُ بْنُ حَارِثَةَ مُضْطَجِعَانِ، فَقَالَ إِنَّ هَذِهِ الأَقْدَامَ بَعْضُهَا مِنْ بَعْضٍ. قَالَ فَسُرَّ بِذَلِكَ النَّبِيُّ ﷺ وَأَعْجَبَهُ، فَأَخْبَرَ بِهِ عَائِشَةَ. [رواه البخاري: ٣٧٣١]

**1536.** Rəvayət edilir ki, Aişə ؓ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ yanımda olarkən, habelə Usamə ibn Zeyd və Zeyd ibn Harisə (hücrəmin bir tərəfində) uzanmış ikən bir qaif[1] mənim yanıma gəlib dedi: "Bu ayaqların biri digərindədir.[2]"

"Bu (söz) Peyğəmbəri ﷺ sevindirdi, onun xoşuna gəldi və o, bunu Aişəyə də bildirdi." (əl-Buxari, 3731)

## 10-cu fəsil. Usamə ibn Zeydin ؓ tərifəlayiq xüsusiyyətləri

## ١٠– باب: ذِكْرُ أُسَامَةَ بْنِ زَيْدٍ ؓ

١٥٣٧ – عَنْ عَائِشَةَ ؓ أَنَّ امْرَأَةً مِنْ بَنِى مَخْزُومٍ سَرَقَتْ، فَقَالُوا مَنْ يُكَلِّمُ فِيهَا النَّبِيَّ ﷺ فَلَمْ يَجْتَرِئْ أَحَدٌ أَنْ يُكَلِّمَهُ، فَكَلَّمَهُ أُسَامَةُ بْنُ زَيْدٍ، فَقَالَ: «إِنَّ بَنِى إِسْرَائِيلَ كَانَ إِذَا سَرَقَ فِيهِمُ الشَّرِيفُ تَرَكُوهُ، وَإِذَا سَرَقَ الضَّعِيفُ قَطَعُوهُ، لَوْ كَانَتْ فَاطِمَةُ لَقَطَعْتُ يَدَهَا». [رواه البخاري: ٣٧٣٣]

**1537.** Aişə ؓ rəvayət edir ki, bənu-Məxzum qəbiləsindən olan (zadəgan) bir qadın oğurluq etmişdi. (Həmqəbilələri) dedilər: "Bu qadına görə[3] Peyğəmbərlə ﷺ kim danışa bilər?" Lakin heç kəs (bu haqda) onunla danışmağa cəsarət etmədi. (Belə olduqda) Usamə ibn Zeyd Peyğəmbərə ﷺ müraciət etdi və Peyğəmbər ﷺ buyurdu: "Vaxtı ilə İsrail oğulları arasında zadəgan (ailəsindən olan) birisi oğurluq etsəydi, ona dəyməzdilər, amma kasıb oğurluq etsəydi, onun əlini kəsərdilər. Əgər Fatimə (oğurluq etmiş) olsa, onun da əlini kəsərəm." (əl-Buxari, 3733)

---

[1] Zahiri görünüşdən bir adamın başqa birisinə doğma və ya qohum olduğunu təyin etməyi bacaran adam.

[2] Yəni bu adamlar bir-birinə doğmadırlar.

[3] Yəni kim bu qadına veriləcək cəzanın yüngülləşdirilməsi üçün havadarlıq edə bilər?

١٥٣٨ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ رضي الله عنهما حَدَّثَ عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ كَانَ يَأْخُذُهُ وَالْحَسَنَ فَيَقُولُ: «اللَّهُمَّ أَحِبَّهُمَا فَإِنِّى أُحِبُّهُمَا». [رواه البخاري: ٣٧٣٥]

**1538.** Usamə ibn Zeyd (r.a.) rəvayət etmişdir ki, Peyğəmbər ﷺ onu Həsənlə birlikdə qucağına alıb deyərdi: "Allahım, onları sev, çünki mən onları sevirəm!" (əl-Buxari, 3735)

## ١١– باب: مَنَاقِبُ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما

## 11-ci fəsil. Abdullah ibn Ömərin (r.a.) tərifəlayiq xüsusiyyətləri

١٥٣٩ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنْ أُخْتِهِ حَفْصَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ قَالَ لَهَا: « إِنَّ عَبْدَ اللَّهِ رَجُلٌ صَالِحٌ». [رواه البخاري: ٣٧٤٠-٣٧٤١]

**1539.** İbn Ömər (r.a.) bacısı Həfsədən rəvayət etmişdir ki, Peyğəmbər ﷺ ona belə demişdir: "Həqiqətən, Abdullah əməlisaleh bir adamdır." (əl-Buxari, 3740-3741)

## ١٢– باب: مَنَاقِبُ عَمَّارٍ وَحُذَيْفَةَ رضي الله عنهما

## 12-ci fəsil. Əmmarın və Huzeyfənin (r.a.) tərifəlayiq xüsusiyyətləri

١٥٤٠ – عَنْ إِبْرَاهِيمَ قَالَ ذَهَبَ عَلْقَمَةُ إِلَى الشَّأْمِ، فَلَمَّا دَخَلَ الْمَسْجِدَ قَالَ اللَّهُمَّ يَسِّرْ لِى جَلِيسًا صَالِحًا. فَجَلَسَ إِلَى أَبِى الدَّرْدَاءِ فَقَالَ أَبُو الدَّرْدَاءِ مِمَّنْ أَنْتَ قَالَ مِنْ أَهْلِ الْكُوفَةِ. قَالَ أَلَيْسَ فِيكُمْ – أَوْ مِنْكُمْ – صَاحِبُ السِّرِّ الَّذِى لاَ يَعْلَمُهُ غَيْرُهُ يَعْنِى حُذَيْفَةَ. قَالَ قُلْتُ بَلَى. قَالَ أَلَيْسَ فِيكُمْ – أَوْ مِنْكُمْ – الَّذِى أَجَارَهُ اللَّهُ عَلَى لِسَانِ نَبِيِّهِ ﷺ يَعْنِى مِنَ الشَّيْطَانِ، يَعْنِى عَمَّارًا. قُلْتُ بَلَى. قَالَ أَلَيْسَ فِيكُمْ – أَوْ مِنْكُمْ – صَاحِبُ السِّوَاكِ أَوِ السِّرَارِ قَالَ بَلَى. قَالَ كَيْفَ كَانَ عَبْدُ اللَّهِ يَقْرَأُ: ﴿وَالَّيْلِ إِذَا يَغْشَىٰ ۝١ وَالنَّهَارِ إِذَا تَجَلَّىٰ ۝٢﴾ قُلْتُ: ﴿وَالذَّكَرِ وَالأُنْثَى﴾. قَالَ مَا زَالَ بِى هَؤُلاَءِ حَتَّى كَادُوا يَسْتَنْزِلُونِى عَنْ شَىْءٍ سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٣٧٤٣]

**1540.** Rəvayət edilir ki, İbrahim demişdir: "(Bir dəfə) Əlqəmə Şama getdi və məscidə daxil olub: "Allahım, mənə əməlisaleh bir həmsöhbət yetir!"- dedi, sonra da gedib Əbu Dərdanın yanında oturdu. Əbu Dərda (ondan): "Kimlərdənsən?"– deyə soruşdu. (Əlqəmə): "Kufəliyəm"– deyə cavab verdi. (Əbu Dərda) soruşdu: "Məgər özündən başqa heç kəsin bilmədiyi sirrin sahibi[1] sizin aranızda deyilmi?" (Bunu deyəndə) o, Huzeyfəni qəsd edirdi. (Əlqəmə): "Elədir!"– dedi. (Əbu Dərda) soruşdu: "Məgər Allahın Öz peyğəmbərinin ﷺ xahişi ilə (şeytandan) qoruduğu kimsə sizin aranızda deyilmi?!" (Bunu deyəndə) o, Əmmarı nəzərdə tuturdu. (Əlqəmə): "Elədir!"– dedi. (Əbu Dərda) soruşdu: "Məgər misvak daşıyan kimsə (və etibarlı olan birisi) sizin aranızda deyilmi?!" (Bunu deyəndə o, Abdullah ibn Məsudu nəzərdə tuturdu.) O: "Elədir!"– dedi. (Əbu Dərda soruşdu: "Abdullah ibn Məsud: **"And olsun** ***yer üzünü zülmətə*** **bürüməkdə olan gecəyə! And olsun** ***günəşin çıxması ilə*** **aydınlaşan gündüzə!"**[2] ayələrini necə oxuyur? (Əlqəmə dedi:) "Mən: "And

[1] Belə ki, Peyğəmbər ﷺ münafiqlərin adlarını yalnız Huzeyfə ibn Yəmənə (r.a.) bildirmişdi.
[2] "əl-Leyl" surəsi, 1-2.

olsun kişiyə və qadına![1]"– deyə cavab verdim. Onda (Əbu Dərda) dedi: "Onlar[2] məni Peyğəmbərdən ﷺ eşitdiyimdən vaz keçməyə vadar edirlər." (əl-Buxari, 3743)

## 13-cü fəsil. Əbu Ubeydə ibn Cərrahın رضي الله عنه tərifəlayiq xüsusiyyətləri

## ١٣– باب: مَنَاقِبُ أَبِى عُبَيْدَةَ بْنِ الْجَرَّاحِ رضي الله عنه

١٥٤١ – عَنْ أَنَسِ بْنِ مَالِك رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «إِنَّ لِكُلِّ أُمَّةٍ أَمِينًا، وَإِنَّ أَمِينَنَا أَيَّتُهَا الأُمَّةُ أَبُو عُبَيْدَةَ بْنُ الْجَرَّاحِ». [رواه البخاري: ٣٧٤٤]

**1541.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər bir ümmətin (içində) ən etibarlı bir adam vardır. Bizim ən çox etibar etdiyimiz isə, ey (müsəlman) ümməti, Əbu Ubeydə ibn Cərrahdır!" (əl-Buxari, 3744)

## 14-cü fəsil. Həsənin və Hüseynin رضي الله عنهما tərifəlayiq xüsusiyyətləri

## ١٤– باب: مَنَاقِبُ الْحَسَنِ وَالْحُسَيْنِ رضي الله عنهما

١٥٤٢ – عَنْ الْبَرَاءِ رضي الله عنه قَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ وَالْحَسَنُ عَلَى عَاتِقِهِ يَقُولُ: «اللَّهُمَّ إِنِّى أُحِبُّهُ فَأَحِبَّهُ». [رواه البخاري: ٣٧٤٩]

**1542.** Rəvayət edilir ki, Bəra رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ Həsəni çiynində apararkən belə dediyini eşitdim: "Allahım, mən onu sevirəm, Sən də onu sev!" (əl-Buxari, 3749)

١٥٤٣ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ لَمْ يَكُنْ أَحَدٌ أَشْبَهَ بِالنَّبِيِّ ﷺ مِنَ الْحَسَنِ بْنِ عَلِيٍّ. [رواه البخاري: ٣٧٥٢]

**1543.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: "Peyğəmbərə ﷺ Həsən ibn Əli qədər çox oxşayan bir kimsə yox idi." (əl-Buxari, 3752)

١٥٤٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ سَأَلَهُ رَجُلٌ عَنِ الْمُحْرِمِ يَقْتُلُ الذُّبَابَ؟ فَقَالَ: أَهْلُ الْعِرَاقِ يَسْأَلُونَ عَنِ الذُّبَابِ وَقَدْ قَتَلُوا ابْنَ ابْنَةِ رَسُولِ اللَّهِ ﷺ، وَقَالَ النَّبِيُّ ﷺ: «هُمَا رَيْحَانَتَاىَ مِنَ الدُّنْيَا». [رواه البخاري: ٣٧٥٣]

**1544.** Rəvayət edilir ki, (həcc ziyarətində) bir nəfər Abdullah ibn Ömərdən رضي الله عنهما ihramda olan adamın milçək öldürməsi barədə soruşdu? (İbn Ömər) dedi: "İraq əhalisi milçək haqqında soruşur. Halbuki, onlar Peyğəmbərin ﷺ qız nəvəsini[3] öldürmüşlər. Peyğəmbər ﷺ demişdir: "Bu dünyada bunlar[4] mənim üçün iki reyhan bitkisi kimidirlər." (əl-Buxari, 3753)

---

[1] Çox güman ki, bu ayə əvvəl-əvvəl bu şəkildə nazil olmuş, sonra isə tamamlanmışdır. Uca Allah buyurur: **"And olsun kişini və qadını yaradana!"** ("əl-Leyl" surəsi, 3). Ola bilsin ki, bunu nə Əlqəmə, nə Abdullah ibn Məsud, nə də Əbu Dərda bilirdi.

[2] Yəni Şam əhli.

[3] Onların xəyanəti nəticəsində Huseyn رضي الله عنه Kərbəla çölündə şəhid edilmişdir.

[4] Burada Peyğəmbərin ﷺ sevimli nəvələri – Həsən və Huseyn رضي الله عنهما nəzərdə tutulur.

## 15-ci fəsil. İbn Abbasın رضي الله عنهما tərifəlayiq xüsusiyyətləri

## ١٥– باب: ذِكْرُ ابْنِ عَبَّاسٍ رضي الله عنهما

١٥٤٥ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: ضَمَّنِي النَّبِيُّ ﷺ إِلَى صَدْرِهِ وَقَالَ: «اللَّهُمَّ عَلِّمْهُ الْحِكْمَةَ».
وَفِي رِوَايَةٍ قَالَ: «عَلِّمْهُ الْكِتَابَ». [رواه البخاري: ٣٧٥٦]

**1545.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ məni bağrına basıb dedi: "Allahım, ona hikmət[1] öyrət!"

Digər rəvayətdə (Peyğəmbər ﷺ) demişdir: "Allahım, ona Kitabı[2] öyrət!" (əl-Buxari, 3756)

## 16-cı fəsil. Xalid ibn Vəlidin رضي الله عنه tərifəlayiq xüsusiyyətləri

## ١٦– باب: مَنَاقِبُ خَالِدِ بْنِ الْوَلِيدِ رضي الله عنه

١٥٤٦ – عَنْ أَنَسٍ رضي الله عنه أَنَّ النَّبِيَّ ﷺ نَعَى زَيْدًا وَجَعْفَرًا وَابْنَ رَوَاحَةَ لِلنَّاسِ قَبْلَ أَنْ يَأْتِيَهُمْ خَبَرُهُمْ، فَقَالَ: «أَخَذَ الرَّايَةَ زَيْدٌ فَأُصِيبَ، ثُمَّ أَخَذَ جَعْفَرٌ فَأُصِيبَ، ثُمَّ أَخَذَ ابْنُ رَوَاحَةَ فَأُصِيبَ – وَعَيْنَاهُ تَذْرِفَانِ – حَتَّى أَخَذَ سَيْفٌ مِنْ سُيُوفِ اللَّهِ حَتَّى فَتَحَ اللَّهُ عَلَيْهِمْ». [رواه البخاري: ٣٧٥٧]

**1546.** Ənəs رضي الله عنه rəvayət edir ki, Zeydin, Cəfərin və (Abdullah) ibn Rəvahanın رضي الله عنه ölüm xəbəri gəlməmişdən əvvəl Peyğəmbər ﷺ ağlaya-ağlaya onların şəhid olduqlarını xəbər verib dedi: "Bayrağı Zeyd götürdü və şəhid oldu. Sonra (bayrağı) Cəfər götürdü və o da şəhid oldu. Sonra (bayrağı) ibn Rəvahə götürdü və o da şəhid oldu. Axırda (bayrağı) Allahın qılıncı[3] sayılan birisi götürdü və Allah (müsəlmanlara bu döyüşdə) qələbə bəxş etdi." (əl-Buxari, 3757)

## 17-ci fəsil. Əbu Huzeyfənin رضي الله عنه azad etdiyi köləsi Salimin رضي الله عنه tərifəlayiq xüsusiyyətləri

## ١٧– باب: مَنَاقِبُ سَالِمٍ مَوْلَى أَبِي حُذَيْفَةَ رضي الله عنه

١٥٤٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو رضي الله عنهما قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «اسْتَقْرِئُوا الْقُرْآنَ مِنْ أَرْبَعَةٍ مِنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ، فَبَدَأَ بِهِ، وَسَالِمٍ مَوْلَى أَبِي حُذَيْفَةَ، وَأُبَيِّ بْنِ كَعْبٍ، وَمُعَاذِ بْنِ جَبَلٍ». [رواه البخاري: ٣٧٥٨]

**1547.** Rəvayət edilir ki, Abdullah ibn Amr رضي الله عنهما demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Quranı yalnız dörd nəfərdən öyrənin: Abdullah ibn Məsuddan, Əbu Huzeyfənin azad etdiyi köləsi Salimdən, Ubey ibn Kəbdən və Muaz ibn Cəbəldən." (əl-Buxari, 3758)

---

[1] Burada Quranı başa düşmək qəsd edilir.

[2] Yəni, Quranı.

[3] "Allahın qılıncına" ərəbcə "seyfullah" deyilir. Peyğəmbər ﷺ bu ləqəbi Xalid ibn Vəlidə məhz bu döyüşdə vermişdir.

## ١٨– باب: فَضْلُ عَائِشَةَ رضي الله عنها

## 18-ci fəsil. Aişənin رضي الله عنها tərifəlayiq xüsusiyyətləri

١٥٤٨ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهَا اسْتَعَارَتْ مِنْ أَسْمَاءَ قِلَادَةً فَهَلَكَتْ، فَأَرْسَلَ رَسُولُ اللَّهِ ﷺ نَاسًا مِنْ أَصْحَابِهِ فِي طَلَبِهَا، فَأَدْرَكَتْهُمُ الصَّلَاةُ، فَصَلَّوْا بِغَيْرِ وُضُوءٍ، فَلَمَّا أَتَوُا النَّبِيَّ ﷺ شَكَوْا ذَلِكَ إِلَيْهِ، فَنَزَلَتْ آيَةُ التَّيَمُّمِ. فَقَالَ أُسَيْدُ بْنُ حُضَيْرٍ جَزَاكِ اللَّهُ خَيْرًا، فَوَاللَّهِ مَا نَزَلَ بِكِ أَمْرٌ قَطُّ إِلَّا جَعَلَ اللَّهُ لَكِ مِنْهُ مَخْرَجًا، وَجَعَلَ لِلْمُسْلِمِينَ فِيهِ بَرَكَةً. [رواه البخاري: ٣٧٧٣]

**1548.** Rəvayət edilir ki, (bir dəfə) Aişə رضي الله عنها (doğma bacısı) Əsmadan رضي الله عنها borca bir boyunbağı aldı. (Bir müddətdən) sonra o, boyunbağını itirdi. Buna görə də Peyğəmbər ﷺ əshabələrindən bir neçəsini göndərdi ki, onu axtarıb tapsınlar. Namaz vaxtı yetişdikdə onlar dəstəmazsız olduqları halda namaz qıldılar. Sonra Peyğəmbərin ﷺ yanına gəldikdə (su tapmadıqlarına görə) ona şikayət etdilər və (elə həmin vaxt) təyəmmüm ayəsi nazil oldu. Useyd ibn Hudeyr (Aişəyə) dedi: “Allah səni xeyirlə mükafatlandırsın! Vallahi, indiyədək sənin başına elə bir iş gəlməmişdir ki, Allah bu işdə sənə bir yol göstərməsin və bu işi müsəlmanlar üçün bərəkətli etməsin.” (əl-Buxari, 3773)

# ٦٣ – كِتَابُ مَنَاقِبِ الأَنْصَارِ

# 63 – Ənsarın tərifəlayiq xüsusiyyətləri kitabı

## ١ – باب:

مَنَاقِبُ الأَنْصَارِ. ﴿وَٱلَّذِينَ تَبَوَّءُو ٱلدَّارَ وَٱلْإِيمَٰنَ مِن قَبْلِهِمْ يُحِبُّونَ مَنْ هَاجَرَ إِلَيْهِمْ وَلَا يَجِدُونَ فِى صُدُورِهِمْ حَاجَةً مِّمَّآ أُوتُوا۟﴾

## 1-ci fəsil. Ənsarın üstünlükləri.

**Uca Allah buyurur: "*Mühacirlərdən* əvvəl *Mədinədə* yurd salmış, *sonra da* iman gətirmiş kimsələr öz yanlarına hicrət edənləri sevir, onlara verdiklərinə görə qəlblərində peşmançılıq hissi duymurlar..."[1]**

١٥٤٩ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ كَانَ يَوْمُ بُعَاثَ يَوْمًا قَدَّمَهُ اللَّهُ لِرَسُولِهِ ﷺ فَقَدِمَ رَسُولُ اللَّهِ ﷺ وَقَدِ افْتَرَقَ مَلَؤُهُمْ، وَقُتِلَتْ سَرَوَاتُهُمْ، وَجُرِّحُوا، فَقَدَّمَهُ اللَّهُ لِرَسُولِهِ ﷺ فِى دُخُولِهِمْ فِى الإِسْلاَمِ. [رواه البخاري: ٣٧٧٧]

**1549.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Buas döyüşünü[2] Allah Öz peyğəmbərinin ﷺ xeyrinə çevirdi. Peyğəmbər ﷺ (Mədinəyə) gəldikdə (oradakı qəbilələrin toplumu) artıq bölünmüş, qəbilə başçıları da ya öldürülmüş, ya da yaralanmışdı. Beləliklə də, Allah həmin günü Öz peyğəmbərinin ﷺ xeyrinə çevirdi və ənsar İslam dinini qəbul etdi." (əl-Buxari, 3777)

## ٢ – باب: قَوْلُ النَّبِىِّ ﷺ: "لَوْلاَ الْهِجْرَةُ لَكُنْتُ مِنَ الأَنْصَارِ"

## 2-ci fəsil. Peyğəmbərin ﷺ: "Əgər hicrət[3] olmasaydı, mən, əlbəttə ki, ənsardan olardım!" sözü

١٥٥٠ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِىِّ ﷺ: «لَوْ أَنَّ الأَنْصَارَ سَلَكُوا وَادِيًا أَوْ شِعْبًا، لَسَلَكْتُ فِى وَادِى الأَنْصَارِ، وَلَوْلاَ الْهِجْرَةُ لَكُنْتُ امْرَأً مِنَ الأَنْصَارِ». [رواه البخاري: ٣٧٧٩]

**1550.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əgər ənsar bir vadiyə və ya dərəyə üz tutsaydı, mən də ənsarın vadisinə gedərdim. Əgər hicrət olmasaydı, mən, əlbəttə ki, ənsardan olardım!" (əl-Buxari, 3779)

## ٣ – باب: حُبُّ الأَنْصَارِ مِنَ الإِيْمَانِ

## 3-cü fəsil. Ənsarı sevmək imandandır

١٥٥١ – عَنْ الْبَرَاءِ رضي الله عنه قَالَ: قَالَ النَّبِىُّ ﷺ: «الأَنْصَارُ لاَ يُحِبُّهُمْ إِلاَّ مُؤْمِنٌ، وَلاَ يُبْغِضُهُمْ إِلاَّ مُنَافِقٌ، فَمَنْ أَحَبَّهُمْ أَحَبَّهُ اللَّهُ، وَمَنْ أَبْغَضَهُمْ أَبْغَضَهُ اللَّهُ». [رواه البخاري: ٣٧٨٣]

---

[1] "əl-Həşr" surəsi, 9.
[2] 527-ci hədisin qeydlərinə bax.
[3] 1-ci hədisin qeydlərinə bax.

**1551.** Bəra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ənsarı yalnız mömin sevər və onlara yalnız münafiq nifrət edər. Kim onları sevsə, Allah onu sevər. Kim onlara nifrət etsə, Allah da ona nifrət edər.” (əl-Buxari, 3783)

## ٤ – باب: قَوْلُ النَّبِيِّ ﷺ لِلأَنْصَارِ: " أَنْتُمْ أَحَبُّ النَّاسِ إِلَيَّ "

## 4-cü fəsil. Peyğəmbərin ﷺ ənsar haqqında: “Siz mənim ən çox sevdiyim insanlarsınız!” deməsi

١٥٥٢ – عَنْ أَنَسٍ ﷺ قَالَ: رَأَى النَّبِيُّ ﷺ النِّسَاءَ وَالصِّبْيَانَ مُقْبِلِينَ مِنْ عُرُسٍ – فَقَامَ النَّبِيُّ ﷺ مُمْثِلاً، فَقَالَ: «اللَّهُمَّ أَنْتُمْ مِنْ أَحَبِّ النَّاسِ إِلَيَّ». قَالَهَا ثَلاَثَ مِرَارٍ. [رواه البخاري: ٣٧٨٥]

**1552.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ qadınların və uşaqların toydan qayıtdığını gördü və ayağa qalxıb üç dəfə (onlara) dedi: “Ay Allah! Siz mənim ən çox sevdiyim insanlarsınız.” (əl-Buxari, 3785)

١٥٥٣ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: جَاءَتِ امْرَأَةٌ مِنَ الأَنْصَارِ إِلَى رَسُولِ اللَّهِ ﷺ وَمَعَهَا صَبِيٌّ لَهَا، فَكَلَّمَهَا رَسُولُ اللَّهِ ﷺ فَقَالَ: «وَالَّذِي نَفْسِي بِيَدِهِ، إِنَّكُمْ أَحَبُّ النَّاسِ إِلَيَّ». مَرَّتَيْنِ. [رواه البخاري: ٣٧٨٦]

**1553.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: “Ənsardan olan bir qadın uşağı ilə birlikdə Peyğəmbərin ﷺ yanına gəldi. Peyğəmbər ﷺ onunla danışdı və ona iki dəfə dedi: “Canım Əlində olan Allaha and olsun ki, siz, həqiqətən də, mənim ən çox sevdiyim insanlarsınız.” (əl-Buxari, 3786)

١٥٥٤ – عَنْ زَيْدِ بْنِ أَرْقَمَ ﷺ قَالَتِ الأَنْصَارُ: يَا رَسُولَ اللَّهِ لِكُلِّ نَبِيٍّ أَتْبَاعٌ، وَإِنَّا قَدِ اتَّبَعْنَاكَ، فَادْعُ اللَّهَ أَنْ يَجْعَلَ أَتْبَاعَنَا مِنَّا. فَدَعَا بِهِ. [رواه البخاري: ٣٧٨٧]

**1554.** Zeyd ibn Ərqam ﷺ rəvayət edir ki, ənsar demişdir: “Ya Rəsulullah, hər bir peyğəmbərin davamçıları olub, biz də sənin yolunu tutub gedirik. Elə isə Allaha dua et ki, bizi sənin davamçılarından etsin.” Peyğəmbər ﷺ də (onlar üçün) dua etdi.” (əl-Buxari, 3787)

## ٥ – باب: فَضْلُ دُورِ الأَنْصَارِ

## 5-ci fəsil. Ənsarın evlərinin fəziləti

١٥٥٥ – عَنْ أَبِي حُمَيْدٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «إِنَّ خَيْرَ دُورِ الأَنْصَارِ دَارُ بَنِي النَّجَّارِ، ثُمَّ بَنِي عَبْدِ الأَشْهَلِ، ثُمَّ دَارُ بَنِي الْحَارِثِ، ثُمَّ بَنِي سَاعِدَةَ، وَفِي كُلِّ دُورِ الأَنْصَارِ خَيْرٌ». فَلَحِقْنَا سَعْدَ بْنَ عُبَادَةَ فَقَالَ أَبَا أُسَيْدٍ أَلَمْ تَرَ أَنَّ نَبِيَّ اللَّهِ ﷺ خَيَّرَ الأَنْصَارَ فَجَعَلَنَا أَخِيرًا فَأَدْرَكَ سَعْدٌ النَّبِيَّ ﷺ فَقَالَ يَا رَسُولَ اللَّهِ، خُيِّرَ دُورُ الأَنْصَارِ فَجُعِلْنَا آخِرًا. فَقَالَ: «أَوَلَيْسَ بِحَسْبِكُمْ أَنْ تَكُونُوا مِنَ الْخِيَارِ». [رواه البخاري: ٣٧٩١]

**1555.** Əbu Humeyd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ənsar evlərinin ən xeyirlisi Nəccar oğullarının evi, sonra Abduləşhəl oğullarının, sonra Haris oğullarının, sonra da Saidə oğullarının (evləridir). Bununla belə ənsardan olan hər kəsin evi xeyirlidir.” Bundan sonra biz Səd ibn Ubadə ilə rastlaşdıq.”

(Əbu Humeyd) dedi: "Ey Əbu Useyd, görmürsən ki, Peyğəmbər ﷺ ənsarın xeyirli olduğunu söyləmiş və bizi axıra saxlamışdır?!" Bundan sonra Səd Peyğəmbərə ﷺ çatıb dedi: "Ya Rəsulullah, ənsarın xeyirli olduğu söylənildi, bizi isə axıra saxladılar." Peyğəmbər ﷺ buyurdu: "Məgər sizə xeyirli insanlardan olmağınız bəs etmirmi?!" (əl-Buxari, 3791)

## ٦– باب: قَوْلُ النَّبِيِّ ﷺ لِلأَنْصَارِ: " اصْبِرُوا حَتَّى تَلْقَوْنِي عَلَى الْحَوْضِ "

## 6-cı fəsil. Peyğəmbərin ﷺ ənsara: "Hovuzumun başında mənimlə görüşənədək səbir edin!" deməsi

١٥٥٦ – عَنْ أُسَيْدِ بْنِ حُضَيْرٍ رضي الله عنه أَنَّ رَجُلاً مِنَ الأَنْصَارِ قَالَ يَا رَسُولَ اللَّهِ، أَلاَ تَسْتَعْمِلُنِى كَمَا اسْتَعْمَلْتَ فُلاَنًا قَالَ: «سَتَلْقَوْنَ بَعْدِى أَثَرَةً فَاصْبِرُوا حَتَّى تَلْقَوْنِى عَلَى الْحَوْضِ». [رواه البخاري: ٣٧٩٢]

**1556.** Usey ibn Hudeyr رضي الله عنه rəvayət edir ki, (bir dəfə) ənsardan biri (Peyğəmbərə ﷺ) dedi: "Ya Rəsulullah, filankəsə vəzifə verdiyin kimi, bəlkə mənə də vəzifə verəsən?" (Peyğəmbər ﷺ) dedi: "Mən (sizin aranızdan getdikdən) sonra (qənimətləri paylayan kəslərin digər insanları sizdən) üstün tutacaqlarını görəcəksiniz. Hovuzumun başında mənimlə görüşənədək səbir edin!" (əl-Buxari, 3792)

١٥٥٧ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ لِلأَنْصَارِ: «إِنَّكُمْ سَتَلْقَوْنَ بَعْدِى أَثَرَةً فَاصْبِرُوا حَتَّى تَلْقَوْنِى، وَمَوْعِدُكُمُ الْحَوْضُ». [رواه البخاري: ٣٧٩٣]

**1557.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ ənsara demişdir: "Mən (sizin aranızdan getdikdən) sonra (qənimətləri paylayan kəslərin digər insanları sizdən) üstün tutacaqlarını görəcəksiniz. Mənə qovuşanadək səbir edin. Sizə vəd edilən yer hovuzumun başıdır." (əl-Buxari, 3793)

## ٧– باب: قَوْلُ اللهِ عز وجل: ﴿وَيُؤْثِرُونَ عَلَىٰٓ أَنفُسِهِمْ وَلَوْ كَانَ بِهِمْ خَصَاصَةٌ﴾

## 7-ci fəsil. Uca Allahın: "Hətta özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tuturlar..."[1] sözü

١٥٥٨ – عَنْ أَبِى هُرَيْرَةَ رضي الله عنه أَنَّ رَجُلاً أَتَى النَّبِيَّ ﷺ فَبَعَثَ إِلَى نِسَائِهِ فَقُلْنَ مَا مَعَنَا إِلاَّ الْمَاءُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ يَضُمُّ، أَوْ يُضِيفُ هَذَا». فَقَالَ رَجُلٌ مِنَ الأَنْصَارِ أَنَا. فَانْطَلَقَ بِهِ إِلَى امْرَأَتِهِ، فَقَالَ أَكْرِمِى ضَيْفَ رَسُولِ اللَّهِ ﷺ فَقَالَتْ مَا عِنْدَنَا إِلاَّ قُوتُ صِبْيَانِى. فَقَالَ هَيِّئِى طَعَامَكِ، وَأَصْبِحِى سِرَاجَكِ، وَنَوِّمِى صِبْيَانَكِ إِذَا أَرَادُوا عَشَاءً. فَهَيَّأَتْ طَعَامَهَا وَأَصْبَحَتْ سِرَاجَهَا، وَنَوَّمَتْ صِبْيَانَهَا، ثُمَّ قَامَتْ كَأَنَّهَا تُصْلِحُ سِرَاجَهَا فَأَطْفَأَتْهُ، فَجَعَلاَ يُرِيَانِهِ أَنَّهُمَا يَأْكُلاَنِ، فَبَاتَا طَاوِيَيْنِ، فَلَمَّا أَصْبَحَ، غَدَا إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: «ضَحِكَ اللَّهُ اللَّيْلَةَ – أَوْ عَجِبَ – مِنْ فَعَالِكُمَا» فَأَنْزَلَ اللَّهُ: ﴿وَيُؤْثِرُونَ عَلَىٰٓ أَنفُسِهِمْ وَلَوْ كَانَ بِهِمْ خَصَاصَةٌ وَمَن يُوقَ شُحَّ نَفْسِهِۦ فَأُوْلَٰٓئِكَ هُمُ ٱلْمُفْلِحُونَ﴾. [رواه البخاري: ٣٧٩٨]

---
[1] "əl-Həşr" surəsi, 9.

**1558.** Əbu Hureyra ﷺ rəvayət edir ki, bir nəfər Peyğəmbərin ﷺ yanına (qonaq) gəldi. O, (əshabələrdən) birini (yemək-içmək gətirmək üçün) zövcələrinin yanına göndərdi. Peyğəmbərin ﷺ zövcələri evdə sudan başqa heç nə olmadığını ona xəbər verdilər. Onda o, (əshabələrinə müraciət edib) dedi: "Kim (mənim qonağıma) qayğı göstərər və ya onu evində qonaq saxlayar?" Ənsardan olan bir nəfər: "Mən!"– deyib onu evinə apardı və zövcəsinə: "Rəsulullahın qonağına layiqincə hörmət et!"- deyə buyurdu. (Zövcəsi ona): "Uşaqlarımın yeməyindən başqa yemək yoxdur!"– deyə cavab verdi. (Əshabə) dedi: "Yeməyi hazırla, çırağı yandır, uşaqlar yemək istəsələr, onları yatızdır!" Zövcəsi yeməyi hazırladı, çırağı yandırdı və uşaqlarını yatızdırdı. Sonra ayağa qalxıb özünü guya çırağı düzəldirmiş kimi göstərdi və bilərəkdən onu söndürdü. Sonra hər ikisi (əllərini qaba uzadaraq) özlərini guya yemək yeyirlərmiş kimi (qonağa) göstərdilər və o gecə onlar ac yatdılar. Səhər açıldıqda hər iki əshabə Peyğəmbərin ﷺ yanına getdi. Peyğəmbər ﷺ (onlara): "Allah sizin dünənki əməlinizə güldü və ya ondan təəccübləndi!"– dedi və bu ayə nazil oldu: **"...Hətta özləri ehtiyac içində olsalar belə, onları özlərindən üstün tuturlar. Nəfsinin tamahından qorunan kimsələr nicat tapanlardır."** (əl-Buxari, 3898)

## ٨– باب: قَوْلُ النَّبِيِّ ﷺ: "اقْبَلُوا مِنْ مُحْسِنِهِمْ وَتَجَاوَزُوا عَنْ مُسِيئِهِمْ "

## 8-ci fəsil. Peyğəmbərin ﷺ: "(Ənsarın) yaxşı işlərini qəbul edin və onların təqsirlərindən keçin!" sözü

**١٥٥٩** – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: مَرَّ أَبُو بَكْرٍ وَالْعَبَّاسُ ﷺ بِمَجْلِسٍ مِنْ مَجَالِسِ الأَنْصَارِ وَهُمْ يَبْكُونَ، فَقَالَ مَا يُبْكِيكُمْ قَالُوا ذَكَرْنَا مَجْلِسَ النَّبِيِّ ﷺ مِنَّا. فَدَخَلَ عَلَى النَّبِيِّ ﷺ فَأَخْبَرَهُ بِذَلِكَ، قَالَ فَخَرَجَ النَّبِيُّ ﷺ وَقَدْ عَصَبَ عَلَى رَأْسِهِ حَاشِيَةَ بُرْدٍ، قَالَ: فَصَعِدَ الْمِنْبَرَ وَلَمْ يَصْعَدْهُ بَعْدَ ذَلِكَ الْيَوْمِ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ، ثُمَّ قَالَ: «أُوصِيكُمْ بِالأَنْصَارِ، فَإِنَّهُمْ كَرِشِي وَعَيْبَتِي، وَقَدْ قَضَوُا الَّذِي عَلَيْهِمْ، وَبَقِيَ الَّذِي لَهُمْ، فَاقْبَلُوا مِنْ مُحْسِنِهِمْ، وَتَجَاوَزُوا عَنْ مُسِيئِهِمْ». [رواه البخاري: ٣٧٩٩]

**1559.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) Əbu Bəkr ﷺ və Abbas ənsardan olan və bir yerə yığışıb ağlayan bir toplumun yanından keçərkən (ikisindən biri onlardan) soruşdu: "Sizi ağladan nədir?" Onlar dedilər: "Peyğəmbərlə ﷺ keçirdiyimiz günlər yadımıza düşüb." Sonra (Abbas) Peyğəmbərin ﷺ yanına gəlib bunu ona xəbər verdi. (Bunu eşidəndə) Peyğəmbər ﷺ başı bürüncəyin haşiyəsi ilə sarınmış halda (evdən) bayıra çıxdı və gəlib minbərə qalxdı. (Peyğəmbər ﷺ) o gündən sonra bir daha minbərə qalxmadı. O, Allaha həmd-səna edib tariflər dedikdən sonra buyurdu: "Mən sizə ənsara (qayğı göstərməyi) buyururam. Çünki onlar mənim can-ciyərim və sirdaşlarımdır. Onlar artıq öz borclarını yerinə yetirmişlər. Bundan sonra onları qazanacaqları (mükafat) gözləyir. Odur ki, onların yaxşı işlərini qəbul edin və onların təqsirlərindən keçin!" (əl-Buxari, 3799)

**١٥٦٠** – عَنْ ابْنَ عَبَّاسٍ ﷺ قَالَ: خَرَجَ رَسُولُ اللَّهِ ﷺ وَعَلَيْهِ مِلْحَفَةٌ، مُتَعَطِّفًا بِهَا عَلَى مَنْكِبَيْهِ، وَعَلَيْهِ عِصَابَةٌ دَسْمَاءُ حَتَّى جَلَسَ عَلَى الْمِنْبَرِ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ، ثُمَّ قَالَ: «أَمَّا بَعْدُ، أَيُّهَا النَّاسُ، فَإِنَّ النَّاسَ يَكْثُرُونَ

وَتَقِلُّ الأَنْصَارُ، حَتَّى يَكُونُوا كَالْمِلْحِ فِى الطَّعَامِ، فَمَنْ وَلِىَ مِنْكُمْ أَمْرًا يَضُرُّ فِيهِ أَحَدًا أَوْ يَنْفَعُهُ، فَلْيَقْبَلْ مِنْ مُحْسِنِهِمْ، وَيَتَجَاوَزْ عَنْ مُسِيئِهِمْ». [رواه البخاري: ٣٨٠٠]

**1560.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ çiyninə atdığı bürüncəyə bürünmüş, başı da yağ rəngində olan bez parça ilə sarınmış halda (evindən) çıxdı. Nəhayət, minbərə qalxıb oturdu və həmd-səna edib təriflər dedikdən sonra buyurdu: “Sonra isə... Ey insanlar! Həqiqətən də, insanlar çoxaldığı halda ənsar azalır və iş o yerə gəlib çatacaq ki, onlar yeməkdəki duz qədər qalacaqlar. Sizdən biriniz kimsəyə zərər və ya fayda verəcək bir iş başında olarsa, qoy onlardan yaxşı işlər görənlərin (yaxşılıqlarını) qəbul etsin və pis işlər görənlərin (təqsirlərindən) keçsin!” (əl-Buxari, 3800)

## 9-cu fəsil. Səd ibn Muazın ﷺ tərifəlayiq xüsusiyyətləri

## ٩- باب: مَنَاقِبُ سَعْدِ بْنِ مُعَاذٍ ﷺ

**١٥٦١** – عَنْ جَابِرٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: «اهْتَزَّ الْعَرْشُ لِمَوْتِ سَعْدِ بْنِ مُعَاذٍ». [رواه البخاري: ٣٨٠٣]

**1561.** Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “(Allahın) Ərşi Səd ibn Muazın ölümündən sarsıldı.” (əl-Buxari, 3803)

## 10-cu fəsil. Ubey ibn Kəbin ﷺ tərifəlayiq xüsusiyyətləri

## ١٠- باب: مَنَاقِبُ أُبَيِّ بْنِ كَعْبٍ ﷺ

**١٥٦٢** – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ لأُبَيٍّ: «إِنَّ اللَّهَ أَمَرَنِى أَنْ أَقْرَأَ عَلَيْكَ ﴿لَمْ يَكُنِ ٱلَّذِينَ كَفَرُوا۟﴾». قَالَ وَسَمَّانِى قَالَ: «نَعَمْ» فَبَكَى. [رواه البخاري: ٣٨٠٩]

**1562.** Ənəs ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ Ubey (ibn Kəbə) dedi: “Allah mənə: “Kitab əhlindən və müşriklərdən inkar edənlər...”[1] surəsini sənə oxumağı buyurdu.” (Ubey) soruşdu: “O, mənim adımı çəkdi?” Peyğəmbər ﷺ: “Bəli!” dedi və (Ubey) ağlamağa başladı” (əl-Buxari, 3809)

## 11-ci fəsil. Zeyd ibn Sabitin ﷺ tərifəlayiq xüsusiyyətləri

## ١١- باب: مَنَاقِبُ زَيْدِ بْنِ ثَابِتٍ ﷺ

**١٥٦٣** – عَنْ أَنَسٍ ﷺ قَالَ: جَمَعَ الْقُرْآنَ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ أَرْبَعَةٌ، كُلُّهُمْ مِنَ الأَنْصَارِ أُبَىٌّ، وَمُعَاذُ بْنُ جَبَلٍ، وَأَبُو زَيْدٍ، وَزَيْدُ بْنُ ثَابِتٍ. قُلْتُ لأَنَسٍ مَنْ أَبُو زَيْدٍ قَالَ أَحَدُ عُمُومَتِى. [رواه البخاري: ٣٨١٠]

**1563.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Peyğəmbər ﷺ zamanında ənsardan olan dörd nəfər Quranı cəm etməklə məşğul idi: Ubey (ibn Kəbə), Muaz ibn Cəbəl, Əbu Zeyd və Zeyd ibn Sabit.”

(Hədisi danışan ravi demişdir:) “Mən Ənəsdən soruşdum: “Əbu Zeyd kimdir?” Dedi: “Əmilərimdən biridir.” (əl-Buxari, 3810)

---

[1] “əl-Beyyinə” surəsi, 1.

## ١٢– باب: مَنَاقِبُ أَبِى طَلْحَةَ ﷺ

## 12-ci fəsil. Əbu Təlhənin ﷺ tərifəlayiq xüsusiyyətləri

١٥٦٤ – عَنْ أَنَسٍ ﷺ قَالَ: لَمَّا كَانَ يَوْمُ أُحُد انْهَزَمَ النَّاسُ عَنِ النَّبِيِّ ﷺ– وَأَبُو طَلْحَةَ بَيْنَ يَدَى النَّبِيِّ ﷺ مُجَوِّبٌ به عَلَيْه بحَجَفَة لَهُ، وَكَانَ أَبُو طَلْحَةَ رَجُلاً رَامِيًا شَدِيدَ الْقدِّ، يَكْسرُ يَوْمَئذ قَوْسَيْنِ أَوْ ثَلاَثًا، وَكَانَ الرَّجُلُ يَمُرُّ مَعَهُ الْجَعْبَةُ مِنَ النَّبْلِ فَيَقُولُ انْشُرْهَا لأَبِى طَلْحَةَ. فَأَشْرَفَ النَّبِيُّ ﷺ يَنْظُرُ إِلَى الْقَوْمِ، فَيَقُولُ أَبُو طَلْحَةَ يَا نَبِيَّ اللَّه بِأَبِى أَنْتَ وَأُمِّى، لاَ تُشْرِفْ يُصِيبُكَ سَهْمٌ مِنْ سِهَامِ الْقَوْمِ، نَحْرِى دُونَ نَحْرِكَ. وَلَقَدْ رَأَيْتُ عَائِشَةَ بِنْتَ أَبِى بَكْرٍ وَأُمَّ سُلَيْمٍ وَإِنَّهُمَا لَمُشَمِّرَتَانِ، أَرَى خَدَمَ سُوقِهِمَا، تُنْقِزَانِ الْقِرَبَ عَلَى مُتُونِهِمَا، تُفْرِغَانِهِ فِى أَفْوَاهِ الْقَوْمِ، ثُمَّ تَرْجِعَانِ فَتَمْلآنِهَا، ثُمَّ تَجِيآنِ فَتُفْرِغَانِهِ فِى أَفْوَاهِ الْقَوْمِ، وَلَقَدْ وَقَعَ السَّيْفُ مِنْ يَدَىْ أَبِى طَلْحَةَ إِمَّا مَرَّتَيْنِ، وَإِمَّا ثَلاَثًا. [رواه البخاري: ٣٨١١]

**1564.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Uhud döyüşündə (bəzi) adamlar Peyğəmbəri ﷺ qoyub geri çəkildikdə Əbu Təlhə onun önündə dayanıb öz qalxanı ilə onu qoruyurdu. Əbu Təlhə yaxşı oxatan, yayının kirişini[1] olduqca möhkəm dartıb (oxu) atan birisi idi. (Bu döyüşdə Əbu Təlhə) iki ya üç yay sındırdı. (Həmin vaxt) kim əlində ox qabı ilə (onların yanından) keçirdisə, (Peyğəmbər ﷺ) ona: "Ox qabını Əbu Təlhənin qabağına sər!"- deyirdi. Peyğəmbər ﷺ Əbu Təlhənin arxasından boylanıb düşmənə baxmaq istəyəndə Əbu Təlhə ona deyirdi: "Ey Allahın peyğəmbəri, atam-anam sənə qurban, baxma, yoxsa onların atdıqları ox sənə dəyər, mənim sinəm sənin üçün sipərdir." (O gün) mən Aişə bint Əbu Bəkrin və Ummu Suleymin topuqlarındakı xalxalları görününcəyədək paltarlarının ətəyini yuxarı qaldırdığını və su tuluqlarını çiyinlərində daşıyıb (yaralıların) ağzına su boşaltdığını, sonra geri qayıdıb tuluqları su ilə doldurduqlarını və (yenə) qayıdıb (yaralıların) ağzına su boşaltdığını gördüm. (Döyüş əsnasında) Əbu Təlhənin qılıncı iki və ya üç kərə onun əlindən yerə düşmüşdü." (əl-Buxari, 3811)

## ١٣– باب: مَنَاقِبُ عَبْدِ اللَّهِ بْنِ سَلاَمٍ ﷺ

## 13-cü fəsil. Abdullah ibn Səlamın ﷺ tərifəlayiq xüsusiyyətləri

١٥٦٥ – عَنْ سَعْدِ بْنِ أَبِى وَقَّاصٍ ﷺ قَالَ: مَا سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ لأَحَدٍ يَمْشِى عَلَى الأَرْضِ إِنَّهُ مِنْ أَهْلِ الْجَنَّةِ. إِلاَّ لِعَبْدِ اللَّهِ بْنِ سَلاَمٍ قَالَ وَفِيهِ نَزَلَتْ هَذِهِ الآيَةُ: ﴿وَشَهِدَ شَاهِدٌ مِّنۢ بَنِىٓ إِسۡرَٰٓءِيلَ﴾ الآيَةَ. [رواه البخاري: ٣٨١٢]

**1565.** Rəvayət edilir ki, Səd ibn Əbu Vəqqas ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ Abdullah ibn Səlamdan başqa yer üzündə gəzən heç bir kimsəyə: "O, Cənnət əhlindəndir!"– dediyini eşitməmişəm. Onun barəsində bu ayə nazil olmuşdur: **"De: "Bir deyin görək, əgər *bu Quran* Allah tərəfindəndirsə və siz də onu inkar etmisinizsə, İsrail oğullarından da bir şahid onun bənzərinə şahidlik edib iman gətiribsə, siz isə təkəbbür göstərmisinizsə, *zülm etmiş olmazsınızmı*? Allah zalımları doğru yola yönəltməz!"**[2] (əl-Buxari, 3812)

---

[1] Ox yayının iki ucuna tarım bağlanan ip.

[2] "əl-Əhqaf", surəsi, 10.

١٥٦٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ سَلاَمٍ ﷺ قَالَ: رَأَيْتُ رُؤْيَا عَلَى عَهْدِ النَّبِيِّ ﷺ فَقَصَصْتُهَا عَلَيْهِ، وَرَأَيْتُ كَأَنِّي فِي رَوْضَةٍ – ذَكَرَ مِنْ سَعَتِهَا وَخُضْرَتِهَا – وَسْطَهَا عَمُودٌ مِنْ حَدِيدٍ، أَسْفَلُهُ فِي الأَرْضِ وَأَعْلاَهُ فِي السَّمَاءِ، فِي أَعْلاَهُ عُرْوَةٌ فَقِيلَ لِي ارْقَهْ. قُلْتُ لاَ أَسْتَطِيعُ. فَأَتَانِي مِنْصَفٌ فَرَفَعَ ثِيَابِي مِنْ خَلْفِي، فَرَقِيتُ حَتَّى كُنْتُ فِي أَعْلاَهَا، فَأَخَذْتُ بِالْعُرْوَةِ، فَقِيلَ لِي اسْتَمْسِكْ. فَاسْتَيْقَظْتُ وَإِنَّهَا لَفِي يَدِي، فَقَصَصْتُهَا عَلَى النَّبِيِّ ﷺ قَالَ: «تِلْكَ الرَّوْضَةُ الإِسْلاَمُ، وَذَلِكَ الْعَمُودُ عَمُودُ الإِسْلاَمِ، وَتِلْكَ الْعُرْوَةُ عُرْوَةُ الْوُثْقَى، فَأَنْتَ عَلَى الإِسْلاَمِ حَتَّى تَمُوتَ». [رواه البخاري: ٣٨١٣]

**1566.** Rəvayət edilir ki, Abdullah ibn Səlam ﷺ demişdir: "Peyğəmbərin ﷺ zamanında mən bir yuxu gördüm və bu yuxunu ona danışdım. Yuxuda gördüm ki, bir bağın içindəyəm." (Abdulla ibn Səlam) bağın geniş və yaşıl olduğunu vəsf etdikdən sonra dedi: "Bağın ortasında aşağı tərəfi yerdə olan, yuxarı tərəfi isə göyə çatan bir dəmir dirək, dirəyin də başında bir tutqac var idi. Kimsə mənə dedi: "Çıx yuxarı!" Dedim: "Bacarmaram!" Bu vaxt yanıma bir xidmətçi gəlib arxa tərəfdən mənim paltarımın ətəyini qaldırdı və mən (dirəyə) çıxmağa başladım. Haçandan-haçana dirəyin başına çatıb tutqacdan yapışdım. (Yenə) kimsə mənə: "(Tutqacdan) möhkəm yapış!"- dedi və mən yuxudan oyandım. Baxdım ki, həmin tutqac əlimdə qalmışdır. Mən bu (hadisəni) Peyğəmbərə ﷺ danışdım. Peyğəmbər ﷺ buyurdu: "(Gördüyün) o bağ – İslam dinidir, dirək – İslamın dirəyidir, tutqac – ən etibarlı dəstəkdir, (bu da o deməkdir ki,) sən son nəfəsinə qədər müsəlman kimi qalcaqsan." (əl-Buxari, 3813)

## 14-cü fəsil. Peyğəmbərin ﷺ Xədicə ﵂ ilə evlənməsi və Xədicənin ﵂ üstünlükləri

## ١٤ – باب: تَزْوِيجُ النَّبِيِّ ﷺ خَدِيجَةَ، وَفَضْلُهَا ﵂

١٥٦٧ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: مَا غِرْتُ عَلَى أَحَدٍ مِنْ نِسَاءِ النَّبِيِّ ﷺ مَا غِرْتُ عَلَى خَدِيجَةَ، وَمَا رَأَيْتُهَا، وَلَكِنْ كَانَ النَّبِيُّ ﷺ يُكْثِرُ ذِكْرَهَا، وَرُبَّمَا ذَبَحَ الشَّاةَ، ثُمَّ يُقَطِّعُهَا أَعْضَاءً، ثُمَّ يَبْعَثُهَا فِي صَدَائِقِ خَدِيجَةَ، فَرُبَّمَا قُلْتُ لَهُ كَأَنَّهُ لَمْ يَكُنْ فِي الدُّنْيَا امْرَأَةٌ إِلاَّ خَدِيجَةُ. فَيَقُولُ إِنَّهَا كَانَتْ وَكَانَتْ، وَكَانَ لِي مِنْهَا وَلَدٌ. [رواه البخاري: ٣٨١٨]

**1567.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Xədicəyə ﵂ qısqandığım qədər Peyğəmbərin ﷺ zövcələrindən heç birinə qısqanmamışam. Hərçənd mən onu heç görməmişdim, lakin Peyğəmbər ﷺ çox tez-tez onu yad edərdi. Olurdu ki, Peyğəmbər ﷺ qoç kəsib onu hissələrə bölürdü, sonra da onları Xədicənin rəfiqələrinə göndərirdi. Hərdən mən ona: "Elə bil yer üzündə Xədicədən başqa qadın yoxdur"– deyərdim, o da cavabında: "Xədicə (nəcib bir qadın) idi, üstəlik mənim ondan övladlarım olmuşdur." (əl-Buxari, 3818)

١٥٦٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: أَتَى جِبْرِيلُ النَّبِيَّ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ هَذِهِ خَدِيجَةُ قَدْ أَتَتْ مَعَهَا إِنَاءٌ فِيهِ إِدَامٌ أَوْ طَعَامٌ أَوْ شَرَابٌ، فَإِذَا هِيَ أَتَتْكَ فَاقْرَأْ عَلَيْهَا السَّلاَمَ مِنْ رَبِّهَا وَمِنِّي، وَبَشِّرْهَا بِبَيْتٍ فِي الْجَنَّةِ مِنْ قَصَبٍ، لاَ صَخَبَ فِيهِ وَلاَ نَصَبَ. [رواه البخاري: ٣٨٢٠]

**1568.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "(Bir dəfə) Cəbrail Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ey Allahın elçisi, bax Xədicə əlində bir qab xörək şirəsi, (və ya yemək, yaxud içməyə bir şey bura) gəlir. Sənin yanına gəlib çatanda ona Rəbbindən və məndən salam söylə və Cənnətdə (onun üçün) içiboş mirvaridən (hazırlanmış), içində də nə səs-küy, nə də yorğunluq olan bir ev ilə onu müjdələ!" (əl-Buxari, 3820)

**١٥٦٩** – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَت: اسْتَأْذَنَتْ هَالَةُ بِنْتُ خُوَيْلِد أُخْتُ خَدِيجَةَ عَلَى رَسُول اللَّه ﷺ، فَعَرَفَ اسْتِئْذَانَ خَدِيجَةَ فَارْتَاعَ لِذَلِكَ، فَقَالَ: «اللَّهُمَّ هَالَةَ». قَالَتْ فَغِرْتُ فَقُلْتُ مَا تَذْكُرُ مِنْ عَجُوزٍ مِنْ عَجَائِزِ قُرَيْشٍ، حَمْرَاءِ الشِّدْقَيْنِ، هَلَكَتْ فِى الدَّهْرِ، قَدْ، أَبْدَلَكَ اللَّهُ خَيْرًا مِنْهَا. [رواه البخاري: ٣٨٢١]

**1569.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Xədicənin bacısı Halə bint Xuveylid Peyğəmbərin ﷺ yanına gəlmək üçün izn istədi və bu, Peyğəmbərə ﷺ (vaxtı ilə) Xədicənin izn istəməsini xatırlatdı. Bu səbəbdən Peyğəmbər ﷺ bərk həyəcanlandı və dedi: "Allahım, (bu ki,) Halədir!"

(Aişə dedi): "Mən (onu) qısqandım və dedim: "Sən çoxdan ölüb getmiş, qureyş qarılarından olub (dişləri tökülmüş) qırmızı damaq bir qarının nəyini xatırlayırsan?! Axı, Allah sənə onun əvəzinə ondan da xeyirlisini nəsib edib."[1] (əl-Buxari, 3821)

## 15-ci fəsil. Hind bint Utbə رضي الله عنها haqqında deyilənlər

## ١٥– باب: ذِكْرُ هِنْدِ بِنْتِ عُتْبَةَ رضي الله عنها

**١٥٧٠** – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: جَاءَتْ هِنْدُ بِنْتُ عُتْبَةَ قَالَتْ يَا رَسُولَ اللَّه، مَا كَانَ عَلَى ظَهْرِ الأَرْضِ مِنْ أَهْلِ خِبَاءٍ أَحَبُّ إِلَيَّ أَنْ يَذِلُّوا مِنْ أَهْلِ خِبَائِكَ، ثُمَّ مَا أَصْبَحَ الْيَوْمَ عَلَى ظَهْرِ الأَرْضِ أَهْلُ خِبَاءٍ أَحَبَّ إِلَيَّ أَنْ يَعِزُّوا مِنْ أَهْلِ خِبَائِكَ. قَالَ وَأَيْضًا وَالَّذِى نَفْسِى بِيَدِه، قَالَتْ يَا رَسُولَ اللَّه إِنَّ أَبَا سُفْيَانَ رَجُلٌ مِسِّيكٌ، فَهَلْ عَلَيَّ حَرَجٌ أَنْ أُطْعِمَ مِنَ الَّذِى لَهُ عِيَالَنَا قَالَ: «لاَ أُرَاهُ إِلاَّ بِالْمَعْرُوفِ». [رواه البخاري: ٣٨٢٥]

**1570.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "(Bir dəfə) Hind bint Utbə (Peyğəmbərin ﷺ) yanına gəlib dedi: "Ya Rəsulullah, (əvvəllər) yer üzündəki (insanlar arasında) sənin ailəndən daha çox zəlil olmağını istədiyim heç bir ailə yox idi. Bu günkü gündə isə yer üzündə sənin ailəndən daha çox hörmət sahibi olmağını istədiyim başqa bir ailə yoxdur." Peyğəmbər ﷺ buyurdu: "Canım Əlində olan Allaha and olsun ki, yenə də.[2]" Hind dedi: "Ya Rəsulullah, Əbu Süfyan xəsis adamdır. Əgər mən onun malından (gizlincə) götürüb uşaqlarımıza xərcləsəm, mənə günah sayılarmı?" (Peyğəmbər ﷺ) buyurdu: "Xeyr (yazılmaz). Ancaq sənə bəs edəcək qədər götürə bilərsən!" (əl-Buxari, 3825)

[1] İmam Əhmədin Müsnəd əsərində hədisin axırında deyilir ki, "...qəzəbdən Peyğəmbərin ﷺ şöhrəsi dəyişdi."

[2] Yəni qəlbindəki iman möhkəmləndikcə bu məhəbbət də artacaq və axırda o nifrətdən əsər-əlamət qalmayacaqdır.

## 16-cı fəsil. Zeyd ibn Amr ibn Nufeylin ﷺ əhvalatı

## ١٦– باب: حَدِيثُ زَيْدِ بْنِ عَمْرِو بْنِ نُفَيْلٍ ﷺ

١٥٧١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ لَقِيَ زَيْدَ بْنَ عَمْرِو بْنِ نُفَيْلٍ بِأَسْفَلِ بَلْدَحَ، قَبْلَ أَنْ يَنْزِلَ عَلَى النَّبِيِّ ﷺ الْوَحْيُ فَقُدِّمَتْ إِلَى النَّبِيِّ ﷺ سُفْرَةٌ، فَأَبَى أَنْ يَأْكُلَ مِنْهَا ثُمَّ قَالَ زَيْدٌ إِنِّي لَسْتُ آكُلُ مِمَّا تَذْبَحُونَ عَلَى أَنْصَابِكُمْ، وَلاَ آكُلُ إِلاَّ مَا ذُكِرَ اسْمُ اللَّهِ عَلَيْهِ. وَأَنَّ زَيْدَ بْنَ عَمْرٍو كَانَ يَعِيبُ عَلَى قُرَيْشٍ ذَبَائِحَهُمْ، وَيَقُولُ الشَّاةُ خَلَقَهَا اللَّهُ، وَأَنْزَلَ لَهَا مِنَ السَّمَاءِ الْمَاءَ، وَأَنْبَتَ لَهَا مِنَ الأَرْضِ، ثُمَّ تَذْبَحُونَهَا عَلَى غَيْرِ اسْمِ اللَّهِ إِنْكَارًا لِذَلِكَ وَإِعْظَامًا لَهُ. [رواه البخاري: ٣٨٢٦]

**1571.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbərə ﷺ hələ vəhy nazil olmamışdan əvvəl o, Bəldəh vadisinin aşağı tərəfində Zeyd ibn Amr ibn Nufeylə rast gəldi. (O yerdə) Peyğəmbərin ﷺ qabağına süfrə sərildi (və hər ikisinə yemək təklif edildi), lakin Peyğəmbər ﷺ bu yeməkdən yemədi. Zeyd isə (öz etirazını bildirib) dedi: "Mən, sizin bütlər qarşısında kəsdiyiniz qurbanlardan yemirəm. Mən ancaq üstündə Allahın adı çəkilmiş ("bismillah" deyilərək kəsilmiş) heyvandan yeyirəm."

(İslamaqədərki dövrdə) Zeyd ibn Amr qureyşlilərin kəsdiyi heyvanları pisləyib deyərdi: "Qoyunu yaradan Allahdır. O, göydən onun üçün su endirir, yerdən onun üçün ot çıxardır. Siz isə onu Allahdan başqasının adı ilə kəsirsiniz." Bununla da, onların əməlini inkar edər və bu işin böyük günah olduğunu bildirərdi." (əl-Buxari, 3826)

## 17-ci fəsil. Cahiliyyə günləri

## ١٧– باب: أَيَّامُ الْجَاهِلِيَّةِ

١٥٧٢ – عَنِ ابْنِ عُمَرَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «أَلاَ مَنْ كَانَ حَالِفًا فَلاَ يَحْلِفْ إِلاَّ بِاللَّهِ». فَكَانَتْ قُرَيْشٌ تَحْلِفُ بِآبَائِهَا، فَقَالَ: «لاَ تَحْلِفُوا بِآبَائِكُمْ». [رواه البخاري: ٣٨٣٦]

**1572.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qoy and içmək istəyən (hər) kəs ancaq Allaha and içsin!" Qureyşlilərə gəlincə, onlar atalarına and içərdilər. (Odur ki, Peyğəmbər ﷺ) buyurdu: "Atalarınıza and içməyin!" (əl-Buxari, 3836)

١٥٧٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: «أَصْدَقُ كَلِمَةٍ قَالَهَا الشَّاعِرُ كَلِمَةُ لَبِيدٍ أَلاَ كُلُّ شَيْءٍ مَا خَلاَ اللَّهَ بَاطِلٌ وَكَادَ أُمَيَّةُ بْنُ أَبِي الصَّلْتِ أَنْ يُسْلِمَ». [رواه البخاري: ٣٨٤١]

**1573.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Doğru söz şair Ləbidin[1] sözüdür. (O demişdir): "Məgər Allahdan başqa nə varsa, batil deyilmi?"[2] Umeyyə ibn Əbu Səltə[3] gəlincə, o, az qalmışdı ki, müsəlman olsun." (əl-Buxari, 3841)

---

[1] Ləbid islamaqədərki dövrdə məşhur şair olmuş, sonradan İslamı qəbul etmişdir.
[2] Beytin ikincisi belədir: "...hər bir ləzzətin, əlbət ki, bir sonu vardır."
[3] Bu adam xristian olmuş və İslam dini ilə maraqlanmışdır.

## ١٨– باب: مَبْعَثُ النَّبِيِّ ﷺ

## 18-ci fəsil. Peyğəmbərin ﷺ (Allahın rəsulu olaraq) göndərilməsi.

**وَ هُوَ مُحَمَّدُ بْنُ عَبْدِ اللَّهِ بْنِ عَبْدِ الْمُطَّلِبِ بْنِ هَاشِمِ بْنِ عَبْدِ مَنَافِ بْنِ قُصَيِّ بْنِ كِلاَبِ بْنِ مُرَّةَ بْنِ كَعْبِ بْنِ لُؤَيِّ بْنِ غَالِبِ بْنِ فِهْرِ بْنِ مَالِكِ بْنِ النَّضْرِ بْنِ كِنَانَةَ بْنِ خُزَيْمَةَ بْنِ مُدْرِكَةَ ابْنِ إِلْيَاسَ بْنِ مُضَرَ بْنِ نِزَارِ بْنِ مَعَدِّ بْنِ عَدْنَانَ**

**O, Muhəmməd ibn Abdullah ibn Abdul-Muttəlib ibn Haşim ibn Abduмənaf ibn Qusey ibn Kilab ibn Murra ibn Kəb ibn Luey ibn Ğalib ibn Fihr ibn Malik ibn ən-Nədr ibn Kinanə ibn Xuzeymə ibn Müdrikə ibn İlyas ibn Mudar ibn Nizar ibn Məaddi ibn Ədnandır.**

١٥٧٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: أُنْزِلَ عَلَى رَسُولِ اللَّهِ ﷺ وَهُوَ ابْنُ أَرْبَعِينَ، فَمَكَثَ ثَلاثَ عَشْرَةَ سَنَةً، ثُمَّ أُمِرَ بِالْهِجْرَةِ، فَهَاجَرَ إِلَى الْمَدِينَةِ، فَمَكَثَ بِهَا عَشْرَ سِنِينَ، ثُمَّ تُوُفِّيَ ﷺ. [رواه البخاري: ٣٨٥١]

**1574.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ qırx yaşında ikən ona (vəhy) nazil olmuşdur. (Bundan sonra) o, on üç il Məkkədə yaşamış, sonra ona hicrət etmək əmr edilmiş və o, Mədinəyə hicrət etmişdir. On il də Mədinədə yaşadıqdan sonra Peyğəmbər ﷺ vəfat etmişdir." (əl-Buxari, 3851)

## ١٩– باب: مَا لَقِيَ النَّبِيُّ ﷺ وَأَصْحَابُهُ مِنَ الْمُشْرِكِينَ بِمَكَّةَ

## 19-cu fəsil. Peyğəmbərin ﷺ və onun əshabələrinin Məkkədə müşriklərin əlindən çəkdiyi əziyyətlər

١٥٧٥ – عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرِو بْنِ الْعَاصِ رضي الله عنهما وَ قَدْ سُئِلَ أَشَدِّ مَا صَنَعَهُ الْمُشْرِكُونَ بِالنَّبِيِّ ﷺ قَالَ: بَيْنَا النَّبِيُّ ﷺ يُصَلِّي فِي حِجْرِ الْكَعْبَةِ إِذْ أَقْبَلَ عُقْبَةُ بْنُ أَبِي مُعَيْطٍ، فَوَضَعَ ثَوْبَهُ فِي عُنُقِهِ فَخَنَقَهُ خَنْقًا شَدِيدًا، فَأَقْبَلَ أَبُو بَكْرٍ حَتَّى أَخَذَ بِمَنْكِبِهِ وَدَفَعَهُ عَنِ النَّبِيِّ ﷺ قَالَ: ﴿أَتَقْتُلُونَ رَجُلًا أَن يَقُولَ رَبِّيَ ٱللَّهُ﴾. [رواه البخاري: ٣٨٥٦]

**1575.** Rəvayət edilir ki, (bir dəfə) Abdullah ibn Amr ibn Asdan رضي الله عنهما müşriklərin Peyğəmbərə ﷺ qarşı etdikləri ən pis hərəkəti barəsində soruşdular. O dedi: "(Bir dəfə) Peyğəmbər ﷺ Kəbənin həyətində[1] namaz qılarkən Uqbə ibn Əbu Muayt gəlib paltarını Peyğəmbərin ﷺ boynuna saldı və onu bərk-bərk boğmağa başladı. Bu vaxt Əbu Bəkr Əbu Muaytın çiynindən tutub onu Peyğəmbərdən ﷺ kənara itələdi və dedi: **"Siz bir adamı: "Rəbbim Allahdır!"– dediyinə görə öldürəcəksinizmi? Halbuki o, Rəbbinizdən sizə açıq-aydın dəlillər gətirdi."[2]** (əl-Buxari, 3856)

---

[1] Bu, Kəbəyə bitişik yarımdairə şəklində hörülmüş, hündür olmayan divarla Kəbənin arasındakı yerdir. Bu yer Hicr və ya Hatim adlanır.

[2] "Ğafir" surəsi, 28.

## 20-ci fəsil. Cinlər haqqında deyilənlər

## ٢٠ – باب: ذِكْرُ الْجِنِّ

١٥٧٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ أَنَّهُ سُئِلَ مَنْ آذَنَ النَّبِيَّ ﷺ بِالْجِنِّ لَيْلَةَ اسْتَمَعُوا الْقُرْآنَ؟ فَقَالَ: أَنَّهُ آذَنَتْ بِهِمْ شَجَرَةٌ. [رواه البخاري: ٣٨٥٩]

**1576.** Rəvayət edilir ki, Abdullah ibn Məsuddan ﷺ soruşdular: "Cinlər Quranı dinlədikləri gecə (bunu) Peyğəmbərə ﷺ kim xəbər vermişdi?" İbn Məsud dedi: "Cinlərin Quranı dinlədiklərini Peyğəmbərə ﷺ bir ağac xəbər vermişdi." (əl-Buxari, 3859)

١٥٧٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّهُ كَانَ يَحْمِلُ مَعَ النَّبِيِّ ﷺ إِدَاوَةً لِوَضُوئِهِ وَحَاجَتِهِ، فَبَيْنَمَا هُوَ يَتْبَعُهُ بِهَا فَقَالَ: «مَنْ هَذَا». فَقَالَ أَنَا أَبُو هُرَيْرَةَ. فَقَالَ: «ابْغِنِي أَحْجَارًا أَسْتَنْفِضْ بِهَا، وَلاَ تَأْتِنِي بِعَظْمٍ وَلاَ بِرَوْثَةٍ». فَأَتَيْتُهُ بِأَحْجَارٍ أَحْمِلُهَا فِي طَرَفِ ثَوْبِي حَتَّى وَضَعْتُ إِلَى جَنْبِهِ ثُمَّ انْصَرَفْتُ، حَتَّى إِذَا فَرَغَ مَشَيْتُ، فَقُلْتُ مَا بَالُ الْعَظْمِ وَالرَّوْثَةِ قَالَ: «هُمَا مِنْ طَعَامِ الْجِنِّ، وَإِنَّهُ أَتَانِي وَفْدُ جِنِّ نَصِيبِينَ وَنِعْمَ الْجِنُّ، فَسَأَلُونِي الزَّادَ، فَدَعَوْتُ اللَّهَ لَهُمْ أَنْ لاَ يَمُرُّوا بِعَظْمٍ وَلاَ بِرَوْثَةٍ إِلاَّ وَجَدُوا عَلَيْهَا طَعَامًا». [رواه البخاري: ٣٨٦٠]

**1577.** Əbu Hureyradan ﷺ rəvayət edilir ki, (adətən) o, Peyğəmbərlə ﷺ (bir yerə getdikdə) özü ilə cürdəkdə su daşıyardı (ki, Peyğəmbər ﷺ) dəstəmaz aldıqda və təbii ehtiyacını rəf etdikdə ondan istifadə etsin. (Bir dəfə yenə) su götürüb Peyğəmbərin ﷺ ardınca getdikdə o soruşdu: "Kimdir o?" Əbu Hureyra ﷺ dedi: "Mənəm, Əbu Hureyra." Peyğəmbər ﷺ buyurdu: "Mənə təmizlənmək üçün bir neçə daş gətir. Nəbadə sümük və ya təzək gətirəsən."

(Əbu Hureyra ﷺ dedi:) "Mən paltarımın ətəyində bir neçə daş gətirib onun yanına qoydum və kənara çəkildim. O, təbii ehtiyacını rəf etdikdən sonra mən (onun yanına) gəlib soruşdum: "Sümüyün və təzəyin əmması nədir?" Peyğəmbər ﷺ dedi: "Bunlar cinlərin yeməyidir. (Bir dəfə) Nəsibin (şəhərindən) mənim yanıma bir dəstə cin gəldi, – nə gözəl cinlər idi onlar, – onlar məndən yemək istədilər. Mən Allaha dua etdim ki, onlar harada sümük və təzək tapsalar, bu onların yeməyi olsun." (əl-Buxari, 3860)

## 21-ci fəsil. (Əshabələrin) Həbəşistana hicrət etməsi

## ٢١ – باب: هِجْرَةُ الْحَبَشَةِ

١٥٧٨ – عَنْ أُمِّ خَالِدٍ بِنْتِ خَالِدٍ ﷺ قَالَتْ: قَدِمْتُ مِنْ أَرْضِ الْحَبَشَةِ وَأَنَا جُوَيْرِيَةٌ فَكَسَانِي رَسُولُ اللَّهِ ﷺ خَمِيصَةً لَهَا أَعْلاَمٌ، فَجَعَلَ رَسُولُ اللَّهِ ﷺ يَمْسَحُ الأَعْلاَمَ بِيَدِهِ وَيَقُولُ: «سَنَاهْ، سَنَاهْ». قَالَ الْحُمَيْدِيُّ يَعْنِي حَسَنٌ حَسَنٌ . [رواه البخاري: ٣٨٧٤]

**1578.** Rəvayət edilir ki, Ummu Xalid bint Xalid ﷺ demişdir: "Mən Həbəşistandan (Mədinəyə) gəldikdə balaca qız idim." Peyğəmbər ﷺ mənə üzərində naxışlar olan paltar geyindirdi və əli ilə bu naxışlara sığal çəkərək: "Sənəh! Sənəh!"– dedi."

Əbu Humeydi demişdir: "Bu, həbəş dilində: "Qəşəngdir, qəşəngdir!"– deməkdir. (əl-Buxari, 3874)

## 22-ci fəsil. Əbu Talibin hekayəsi — ٢٢– باب: قِصَّةُ أَبِى طَالِبٍ

١٥٧٩ – عَنْ الْعَبَّاسِ بْنِ عَبْدِ الْمُطَّلِبِ ﷺ قَالَ لِلنَّبِيِّ ﷺ مَا أَغْنَيْتَ عَنْ عَمِّكَ فَإِنَّهُ كَانَ يَحُوطُكَ وَيَغْضَبُ لَكَ. قَالَ: «هُوَ فِى ضَحْضَاحٍ مِنْ نَارٍ، وَلَوْلاَ أَنَا لَكَانَ فِى الدَّرَكِ الأَسْفَلِ مِنَ النَّارِ». [رواه البخاري: ٣٨٨٣]

**1579.** Rəvayət edilir ki, (bir dəfə) Abbas ibn Abdul-Muttəlib ﷺ Peyğəmbərə ﷺ dedi: "Əmin (Əbu Talibə) sənin nə köməyin dəyib? Axı, o, səni müdafiə edərdi, (kimsə) sənin (xətrinə dəyəndə) qəzəblənərdi." Peyğəmbər ﷺ dedi: "O, Cəhənnəm odunun üst qatındadır. Əgər mən olmasaydım, o, Cəhənnəmin lap dibində olardı." (əl-Buxari, 3883)

١٥٨٠ – عَنْ أَبِى سَعِيدٍ الْخُدْرِيِّ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ وَذُكِرَ عِنْدَهُ عَمُّهُ فَقَالَ «لَعَلَّهُ تَنْفَعُهُ شَفَاعَتِى يَوْمَ الْقِيَامَةِ، فَيُجْعَلُ فِى ضَحْضَاحٍ مِنَ النَّارِ، يَبْلُغُ كَعْبَيْهِ، يَغْلِى مِنْهُ دِمَاغُهُ». [رواه البخاري: ٣٨٨٥]

**1580.** Əbu Səid əl-Xudri ﷺ rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbərin ﷺ əmisindən söz düşərkən mən onun belə dediyini eşitdim: "Ola bilsin ki, Qiyamət günü mənim şəfaətim ona fayda versin və onu Cəhənnəm odunun üst qatına salsınlar. (Orada) od onun topuqlarına çatacaq, (lakin) istisindən onun beyni qaynayacaq." (əl-Buxari, 3885)

## 23-cü fəsil. Gecə səfəri haqqında (varid olmuş) hədis — ٢٣– باب: حَدِيثُ الإِسْرَاءِ

١٥٨١ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: «لَمَّا كَذَّبَنِى قُرَيْشٌ قُمْتُ فِى الْحِجْرِ، فَجَلاَ اللَّهُ لِى بَيْتَ الْمَقْدِسِ، فَطَفِقْتُ أُخْبِرُهُمْ عَنْ آيَاتِهِ وَأَنَا أَنْظُرُ إِلَيْهِ». [رواه البخاري: ٣٨٨٦]

**1581.** Cabir ibn Abdullah ﷺ rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Qureyşlilər (gecə səfərim haqqında dediklərimi) təkzib etdikdə mən (gedib) Hicrədə[1] durdum. (Bu vaxt) Allah Beytul-Məqdisi mənə göstərdi və mən ona baxaraq onun əlamətlərini onlara bildirdim." (əl-Buxari, 3886)

## 24-cü fəsil. Merac[2] — ٢٤– باب: الْمِعْرَاجُ

١٥٨٢ – عَنْ مَالِكِ بْنِ صَعْصَعَةَ ﷺ أَنَّ نَبِيَّ اللَّهِ ﷺ حَدَّثَهُمْ عَنْ لَيْلَةِ أُسْرِىَ بِهِ «بَيْنَمَا أَنَا فِى الْحَطِيمِ – وَرُبَّمَا قَالَ فِى الْحِجْرِ – مُضْطَجِعًا، إِذْ أَتَانِى آتٍ فَقَدَّ – قَالَ وَسَمِعْتُهُ يَقُولُ فَشَقَّ – مَا بَيْنَ هَذِهِ إِلَى هَذِهِ – فَقُلْتُ

[1] 1575-ci hədisin qeydlərinə bax.
[2] Merac deyildikdə, Peyğəmbərin ﷺ göyə – Uca Allahın hüzuruna yüksəlməsi qəsd edilir.

لِلْجَارُود وَهُوَ إِلَى جَنْبِى مَا يَعْنِى بِهِ قَالَ مِنْ ثُغْرَةِ نَحْرِهِ إِلَى شِعْرَتِهِ، وَسَمِعْتُهُ يَقُولُ مِنْ قَصِّهِ إِلَى شِعْرَتِهِ – فَاسْتَخْرَجَ قَلْبِى، ثُمَّ أُتِيتُ بِطَسْتٍ مِنْ ذَهَبٍ مَمْلُوءَةٍ إِيمَانًا، فَغُسِلَ قَلْبِى ثُمَّ حُشِىَ، ثُمَّ أُوتِيتُ بِدَابَّةٍ دُونَ الْبَغْلِ وَفَوْقَ الْحِمَارِ أَبْيَضَ». – فَقَالَ لَهُ الْجَارُودُ هُوَ الْبُرَاقُ يَا أَبَا حَمْزَةَ قَالَ أَنَسٌ نَعَمْ، يَضَعُ خَطْوَهُ عِنْدَ أَقْصَى طَرْفِهِ – «فَحُمِلْتُ عَلَيْهِ، فَانْطَلَقَ بِى جِبْرِيلُ حَتَّى أَتَى السَّمَاءَ الدُّنْيَا فَاسْتَفْتَحَ، فَقِيلَ مَنْ هَذَا قَالَ جِبْرِيلُ. قِيلَ وَمَنْ مَعَكَ قَالَ مُحَمَّدٌ. قِيلَ وَقَدْ أُرْسِلَ إِلَيْهِ قَالَ نَعَمْ. قِيلَ مَرْحَبًا بِهِ، فَنِعْمَ الْمَجِىءُ جَاءَ فَفَتَحَ، فَلَمَّا خَلَصْتُ، فَإِذَا فِيهَا آدَمُ، فَقَالَ هَذَا أَبُوكَ آدَمُ فَسَلِّمْ عَلَيْهِ. فَسَلَّمْتُ عَلَيْهِ فَرَدَّ السَّلاَمَ ثُمَّ قَالَ مَرْحَبًا بِالاِبْنِ الصَّالِحِ وَالنَّبِىِّ الصَّالِحِ. ثُمَّ صَعِدَ حَتَّى أَتَى السَّمَاءَ الثَّانِيَةَ فَاسْتَفْتَحَ، قِيلَ مَنْ هَذَا قَالَ جِبْرِيلُ. قِيلَ وَمَنْ مَعَكَ قَالَ مُحَمَّدٌ. قِيلَ وَقَدْ أُرْسِلَ إِلَيْهِ قَالَ نَعَمْ. قِيلَ مَرْحَبًا بِهِ فَنِعْمَ الْمَجِىءُ جَاءَ. فَفَتَحَ، فَلَمَّا خَلَصْتُ، إِذَا يَحْيَى وَعِيسَى، وَهُمَا ابْنَا الْخَالَةِ قَالَ هَذَا يَحْيَى وَعِيسَى فَسَلِّمْ عَلَيْهِمَا. فَسَلَّمْتُ فَرَدَّا، ثُمَّ قَالاَ مَرْحَبًا بِالأَخِ الصَّالِحِ وَالنَّبِىِّ الصَّالِحِ. ثُمَّ صَعِدَ بِى إِلَى السَّمَاءِ الثَّالِثَةِ، فَاسْتَفْتَحَ قِيلَ مَنْ هَذَا قَالَ جِبْرِيلُ. قِيلَ وَمَنْ مَعَكَ قَالَ مُحَمَّدٌ. قِيلَ وَقَدْ أُرْسِلَ إِلَيْهِ قَالَ نَعَمْ. قِيلَ مَرْحَبًا بِهِ، فَنِعْمَ الْمَجِىءُ جَاءَ. فَفُتِحَ، فَلَمَّا خَلَصْتُ إِذَا يُوسُفُ. قَالَ هَذَا يُوسُفُ فَسَلِّمْ عَلَيْهِ. فَسَلَّمْتُ عَلَيْهِ فَرَدَّ، ثُمَّ قَالَ مَرْحَبًا بِالأَخِ الصَّالِحِ وَالنَّبِىِّ الصَّالِحِ، ثُمَّ صَعِدَ بِى حَتَّى أَتَى السَّمَاءَ الرَّابِعَةَ، فَاسْتَفْتَحَ، قِيلَ مَنْ هَذَا قَالَ جِبْرِيلُ. قِيلَ وَمَنْ مَعَكَ قَالَ مُحَمَّدٌ. قِيلَ أَوَقَدْ أُرْسِلَ إِلَيْهِ قَالَ نَعَمْ. قِيلَ مَرْحَبًا بِهِ، فَنِعْمَ الْمَجِىءُ جَاءَ. فَفُتِحَ، فَلَمَّا خَلَصْتُ إِلَى إِدْرِيسَ قَالَ هَذَا إِدْرِيسُ فَسَلِّمْ عَلَيْهِ. فَسَلَّمْتُ عَلَيْهِ فَرَدَّ ثُمَّ قَالَ مَرْحَبًا بِالأَخِ الصَّالِحِ وَالنَّبِىِّ الصَّالِحِ. ثُمَّ صَعِدَ بِى حَتَّى أَتَى السَّمَاءَ الْخَامِسَةَ، فَاسْتَفْتَحَ، قِيلَ مَنْ هَذَا قَالَ جِبْرِيلُ. قِيلَ وَمَنْ مَعَكَ قَالَ مُحَمَّدٌ ﷺ. قِيلَ وَقَدْ أُرْسِلَ إِلَيْهِ قَالَ نَعَمْ. قِيلَ مَرْحَبًا بِهِ، فَنِعْمَ الْمَجِىءُ جَاءَ. فَلَمَّا خَلَصْتُ فَإِذَا هَارُونُ قَالَ هَذَا هَارُونُ فَسَلِّمْ عَلَيْهِ. فَسَلَّمْتُ عَلَيْهِ فَرَدَّ ثُمَّ قَالَ مَرْحَبًا بِالأَخِ الصَّالِحِ وَالنَّبِىِّ الصَّالِحِ. ثُمَّ صَعِدَ بِى حَتَّى أَتَى السَّمَاءَ السَّادِسَةَ، فَاسْتَفْتَحَ، قِيلَ مَنْ هَذَا قَالَ جِبْرِيلُ. قِيلَ مَنْ مَعَكَ قَالَ مُحَمَّدٌ. قِيلَ وَقَدْ أُرْسِلَ إِلَيْهِ قَالَ نَعَمْ. قَالَ مَرْحَبًا بِهِ، فَنِعْمَ الْمَجِىءُ جَاءَ، فَلَمَّا خَلَصْتُ، فَإِذَا مُوسَى قَالَ هَذَا مُوسَى فَسَلِّمْ عَلَيْهِ، فَسَلَّمْتُ عَلَيْهِ فَرَدَّ ثُمَّ قَالَ مَرْحَبًا بِالأَخِ الصَّالِحِ وَالنَّبِىِّ الصَّالِحِ. فَلَمَّا تَجَاوَزْتُ بَكَى، قِيلَ لَهُ مَا يُبْكِيكَ قَالَ أَبْكِى لأَنَّ غُلاَمًا بُعِثَ بَعْدِى، يَدْخُلُ الْجَنَّةَ مِنْ أُمَّتِهِ أَكْثَرُ مَنْ يَدْخُلُهَا مِنْ أُمَّتِى. ثُمَّ صَعِدَ بِى إِلَى السَّمَاءِ السَّابِعَةِ، فَاسْتَفْتَحَ جِبْرِيلُ، قِيلَ مَنْ هَذَا قَالَ جِبْرِيلُ. قِيلَ وَمَنْ مَعَكَ قَالَ مُحَمَّدٌ. قِيلَ وَقَدْ بُعِثَ إِلَيْهِ. قَالَ نَعَمْ. قَالَ مَرْحَبًا بِهِ، فَنِعْمَ الْمَجِىءُ جَاءَ فَلَمَّا خَلَصْتُ، فَإِذَا إِبْرَاهِيمُ قَالَ هَذَا أَبُوكَ فَسَلِّمْ عَلَيْهِ. قَالَ فَسَلَّمْتُ عَلَيْهِ، فَرَدَّ السَّلاَمَ قَالَ مَرْحَبًا بِالاِبْنِ الصَّالِحِ وَالنَّبِىِّ الصَّالِحِ. ثُمَّ رُفِعَتْ لِى سِدْرَةُ الْمُنْتَهَى، فَإِذَا نَبِقُهَا مِثْلُ قِلاَلِ هَجَرَ، وَإِذَا وَرَقُهَا مِثْلُ آذَانِ الْفِيَلَةِ قَالَ هَذِهِ سِدْرَةُ الْمُنْتَهَى، وَإِذَا أَرْبَعَةُ أَنْهَارٍ نَهْرَانِ بَاطِنَانِ، وَنَهْرَانِ ظَاهِرَانِ. فَقُلْتُ مَا هَذَانِ يَا جِبْرِيلُ قَالَ أَمَّا الْبَاطِنَانِ، فَنَهَرَانِ فِى الْجَنَّةِ، وَأَمَّا الظَّاهِرَانِ فَالنِّيلُ وَالْفُرَاتُ. ثُمَّ رُفِعَ لِى الْبَيْتُ الْمَعْمُورُ، ثُمَّ أُتِيتُ بِإِنَاءٍ مِنْ خَمْرٍ، وَإِنَاءٍ مِنْ لَبَنٍ وَإِنَاءٍ مِنْ عَسَلٍ، فَأَخَذْتُ اللَّبَنَ، فَقَالَ هِىَ الْفِطْرَةُ أَنْتَ عَلَيْهَا وَأُمَّتُكَ. ثُمَّ فُرِضَتْ عَلَىَّ الصَّلَوَاتُ خَمْسِينَ صَلاَةً كُلَّ يَوْمٍ. فَرَجَعْتُ فَمَرَرْتُ عَلَى مُوسَى، فَقَالَ بِمَا أُمِرْتَ قَالَ أُمِرْتُ بِخَمْسِينَ صَلاَةً كُلَّ يَوْمٍ. قَالَ إِنَّ أُمَّتَكَ لاَ تَسْتَطِيعُ خَمْسِينَ صَلاَةً كُلَّ يَوْمٍ، وَإِنِّى وَاللَّهِ قَدْ جَرَّبْتُ النَّاسَ قَبْلَكَ، وَعَالَجْتُ بَنِى إِسْرَائِيلَ أَشَدَّ الْمُعَالَجَةِ، فَارْجِعْ إِلَى رَبِّكَ فَاسْأَلْهُ التَّخْفِيفَ لأُمَّتِكَ. فَرَجَعْتُ، فَوَضَعَ عَنِّى عَشْرًا، فَرَجَعْتُ إِلَى مُوسَى فَقَالَ مِثْلَهُ، فَرَجَعْتُ فَوَضَعَ عَنِّى عَشْرًا، فَرَجَعْتُ إِلَى مُوسَى فَقَالَ مِثْلَهُ، فَرَجَعْتُ فَوَضَعَ عَنِّى عَشْرًا، فَرَجَعْتُ إِلَى مُوسَى فَقَالَ مِثْلَهُ، فَرَجَعْتُ فَأُمِرْتُ بِعَشْرِ صَلَوَاتٍ كُلَّ يَوْمٍ، فَرَجَعْتُ فَقَالَ مِثْلَهُ، فَرَجَعْتُ فَأُمِرْتُ بِخَمْسِ صَلَوَاتٍ كُلَّ يَوْمٍ، فَرَجَعْتُ إِلَى مُوسَى، فَقَالَ بِمَا أُمِرْتَ قُلْتُ أُمِرْتُ بِخَمْسِ صَلَوَاتٍ كُلَّ يَوْمٍ. قَالَ إِنَّ أُمَّتَكَ لاَ تَسْتَطِيعُ خَمْسَ صَلَوَاتٍ كُلَّ يَوْمٍ، وَإِنِّى قَدْ جَرَّبْتُ النَّاسَ قَبْلَكَ، وَعَالَجْتُ بَنِى إِسْرَائِيلَ أَشَدَّ الْمُعَالَجَةِ،

فَارْجِعْ إِلَى رَبِّكَ فَاسْأَلْهُ التَّخْفِيفَ لأُمَّتِكَ. قَالَ سَأَلْتُ رَبِّى حَتَّى اسْتَحْيَيْتُ، وَلَكِنْ أَرْضَى وَأُسَلِّمُ – قَالَ – فَلَمَّا جَاوَزْتُ نَادَى مُنَادٍ أَمْضَيْتُ فَرِيضَتِى وَخَفَّفْتُ عَنْ عِبَادِى». [رواه البخاري: ٣٨٨٧]

**1582.** Malik ibn Sasaə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə səfəri haqqında (bunları) danışmışdır: "Mən Hatimdə[1] (və ya Hicrədə) uzanmış ikən bir nəfər[2] yanıma gəldi və (bədənimi) buradan bura kimi[3] yarıb qəlbimi çıxartdı. Sonra yanıma içi imanla dolu olan qızıl ləyən gətirdilər. Qəlbimi (Zəmzəm suyu ilə) yuduqdan sonra onu (imanla) doldurdular. Sonra mənim yanıma qatırdan alçaq və uzunqulaqdan hündür olan, ağ rəngli bir heyvan gətirdilər." (Carud dedi: "Ey Əbu Həmzə, bu, Buraq idimi?" Ənəs dedi: "Bəli, o, addımını insanın gördüyü son nöqtəyə qoyurdu." Peyğəmbər ﷺ davam edib dedi:) "Mən heyvana mindikdən sonra Cəbrail məni özü ilə apardı. Nəhayət, dünya səmasına gəlib çatdıqda o, qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "Bəli!"– dedi. Onlar dedilər: "Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" Sonra qapılar açıldı. Mən içəri keçdikdə (orada) Adəmi gördüm. (Cəbrail): "Bu, atan Adəmdir, salam ver ona!"- dedi, mən də ona salam verdim. O, mənim salamımı aldı və dedi: "Xoş gəlmisən, ey əməlisaleh oğul və əməlisaleh peyğəmbər!" Sonra biz ikinci səmaya qalxdıq və (Cəbrail) qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "Bəli!"– dedi. Onlar dedilər: "Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" Sonra qapılar açıldı. Mən içəri keçdikdə (orada) xalauşaqlarını – Yəhyanı və İsanı gördüm. (Cəbrail): "Bu, Yəhya və İsadır, salam ver onlara!"- dedi, mən də onlara salam verdim. Onlar mənim salamımı aldıqdan sonra dedilər: "Xoş gəlmisən, ey əməlisaleh qardaş və əməlisaleh peyğəmbər!" Sonra biz üçüncü səmaya qalxdıq və (Cəbrail) qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "Bəli!"– dedi. Onlar dedilər: "Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" Sonra qapılar açıldı. Mən içəri keçdikdə (orada) Yusufu gördüm. (Cəbrail): "Bu, Yusufdur, salam ver ona!"- dedi, mən də ona salam verdim. O, mənim salamımı aldıqdan sonra dedi: "Xoş gəlmisən, ey əməlisaleh qardaş və əməlisaleh peyğəmbər!" Sonra biz dördüncü səmaya qalxdıq və (Cəbrail) qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "Bəli!"– dedi. Onlar dedilər: "Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" Sonra qapılar açıldı. Mən içəri keçdikdə (orada) İdrisi gördüm. (Cəbrail): "Bu, İdrisdir, salam ver

---

[1] 1575-ci hədisin qeydlərinə bax.

[2] Yəni Cəbrail ﷺ.

[3] Ravi demişdir: "Mən Caruddan soruşdum: "O: "burdan bura kimi" deyəndə nə qəsd edirdi?" Dedi: "boğazından və ya köksündən qarnının alt nahiyəsinə qədər."

ona!"- dedi, mən də ona salam verdim. O, mənim salamımı aldıqdan sonra dedi: "Xoş gəlmisən, ey əməlisaleh qardaş və əməlisaleh peyğəmbər!" Sonra biz beşinci səmaya qalxdıq və (Cəbrail) qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "Bəli!"– dedi. Onlar dedilər: "Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" (Sonra qapılar açıldı.) Mən içəri keçdikdə (orada) Harunu gördüm. (Cəbrail): "Bu, Harundur, salam ver ona!"- dedi, mən də ona salam verdim. O, mənim salamımı aldıqdan sonra dedi: "Xoş gəlmisən, ey əməlisaleh qardaş və əməlisaleh peyğəmbər!" Sonra biz altıncı səmaya qalxdıq və (Cəbrail) qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "Bəli!"– dedi. Onlar dedilər: "Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" (Sonra qapılar açıldı.) Mən içəri keçdikdə (orada) Musanı gördüm. (Cəbrail): "Bu, Musadır, salam ver ona!"– dedi, mən də ona salam verdim. O, mənim salamımı aldıqdan sonra dedi: "Xoş gəlmisən, ey əməlisaleh qardaş və əməlisaleh peyğəmbər!" Mən onun yanından keçib getdikdə o ağladı. Ondan: "Nə üçün ağlayırsan?"– deyə soruşdular. Musa dedi: "Məndən sonra göndərilmiş bu cavan oğlanın ümmətindən Cənnətə daxil olanların sayı, mənim ümmətimdən ora daxil olanların sayından qat-qat artıq olacaq." Sonra biz yeddinci səmaya qalxdıq və (Cəbrail) qapının açılmasını xahiş etdi. (Gözətçilər): "Kimdir o?"– deyə soruşdular. O: "Cəbraildir!"– dedi. Onlar: "Yanındakı kimdir?"– deyə soruşdular. O: "Muhəmməddir!"– dedi. Onlar soruşdular: "Onu çağırıblarmı?" Cəbrail: "Bəli!"– dedi. Onlar dedilər: "Xoş gəlib, səfa gətirib! O, nə gözəl ziyarətçidir!" (Sonra qapılar açıldı.) Mən içəri keçdikdə (orada) İbrahimi gördüm. (Cəbrail): "Bu, atan İbrahimdir, salam ver ona!"- dedi, mən də ona salam verdim. O, mənim salamımı aldıqdan sonra dedi: "Xoş gəlmisən, ey əməlisaleh oğul və əməlisaleh peyğəmbər!" Sonra mənə son həddəki Sidr ağacını[1] göstərdilər. Onun meyvələri Həcər (məmləkətində) düzəldilən saxsı səhənglərə bənzəyirdi, yarpaqları da fil qulaqları boyda idi. (Cəbrail): "Bu, Sidrətul-Muntəhadır"- dedi. Bu ağacın dibindən dörd çay axırdı. Bu çaylardan ikisi altdan, ikisi də üstdən axırdı. Mən soruşdum: "Bu nə çaylardır, ey Cəbrail?" Dedi. "Altdakı çaylar Cənnətdən axır. Üstdəki çaylar isə Nil və Furat çaylarıdır." Sonra mənə Beytul-Məmuru[2] göstərdilər.[3] Sonra mənə bir qab şərab, bir qab süd və bir qab bal gətirdilər. Mən südü götürdüm. Onda (Cəbrail) dedi: "Budur fitrət, sən və sənin ümmətin (fitrət) üzərindədir.[4] Sonra mənə gündəlik olaraq əlli (vaxt) namaz qılmaq vacib buyruldu. Mən geri qayıtdım və Musanın

---

[1] Sidrətul-Muntəha: Son hüdud şanaqülləsi. Yeddinci göydə bitən ağac. O, bu adını ona görə alıb ki, yerdən gedən və Allahdan nazil olan hər nə varsa, ona qədər gedib çatır.

[2] Bu ev yeddinci səmada bilavasitə Kəbənin üstündə yerləşən məbəddir. Hər gün onu yetmiş min mələk ziyarət edir və bir daha ora qayıtmırlar.

[3] Digər rəvayətdə deyilir: "Mən Cəbraildən onun barəsində soruşdum. Dedi: "Bu Beytul-Məmurdur. Hər gün onun içində yetmiş min mələk namaz qılır, sonra oradan çıxır və bir daha oraya qayıtmır."

[4] Yəni tövhidə meylli.

yanına gəlib çatdıqda, o (məndən): “Sənə nə əmr edildi?”– deyə soruşdu. Dedim: “Mənə gündəlik olaraq əlli vaxt namaz qılmaq vacib buyruldu.” Musa dedi: “Sənin ümmətin gündəlik olaraq əlli (vaxt) namazı qıla bilməyəcək. Vallahi ki, mən səndən əvvəl bunu insanlara tətbiq etmək və İsrail oğullarını haqq yola çəkmək istədim, (lakin heç nə alınmadı). Rəbbinin yanına qayıt və Ondan ümmətin üçün (bu hökmü) yüngülləşdirməyi xahiş et!” Mən Allahın yanına qayıdıb (Ona yalvardım) və O, vacib namazların sayını qırxa endirdi. Sonra mən Musanın yanına qayıtdım və o, (əvvəlcə) dediklərini bir də (mənə) təkrar söylədi. Sonra mən (Allahın) yanına qayıtdım və Allah vacib namazların sayını otuza endirdi. Sonra mən Musanın yanına qayıtdım və o, (əvvəlcə) dediklərini bir də (mənə) təkrar söylədi. Mən bir də (Allahın) yanına qayıtdım və Allah vacib namazların sayını iyirmiyə endirdi. Sonra mən Musanın yanına qayıtdım və o, (əvvəlcə) dediklərini bir də (mənə) təkrar söylədi. Mən bir daha (Allahın) yanına qayıtdım və mənə gündəlik olaraq on vaxt namaz qılmaq vacib buyruldu. Sonra mən (Musanın yanına) qayıtdım və o, (əvvəlcə) dediklərini bir də (mənə) təkrar söylədi. Mən (axırıncı kərə Allahın) yanına qayıtdım və mənə gündəlik olaraq beş vaxt namaz qılmaq vacib buyruldu. Sonra mən Musanın yanına qayıtdım və o, məndən: “Sənə nə əmr edildi?”– deyə soruşdu. Dedim: “Mənə gündəlik olaraq beş vaxt namaz qılmaq əmr olundu?” Musa dedi: “Sənin ümmətin gündəlik olaraq beş (vaxt) namazı qıla bilməyəcək. Mən səndən əvvəl bunu insanlara tətbiq etmək və İsrail oğullarını haqq yola çəkmək istədim, (lakin heç nə alınmadı). Rəbbinin yanına qayıt və Ondan ümmətin üçün (bu hökmü) yüngülləşdirməyi xahiş et!” Dedim: “Mən Rəbbimdən (yetərincə) istədim, artıq (nə isə istəməyə) üzüm gəlmir. Lakin mən (bu hökmlə) razıyam və buna boyun əyirəm.” Mən çıxıb getdikdə belə bir səda gəldi: “Mən əzəldən yazdığım hökmü vacib buyurdum, *sonra da* qullarımın yükünü yüngülləşdirdim.[1]” (əl-Buxari, 3887)

١٥٨٣ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما فِي قَوْلِهِ تَعَالَى: ﴿وَمَا جَعَلْنَا ٱلرُّءْيَا ٱلَّتِىٓ أَرَيْنَٰكَ إِلَّا فِتْنَةً لِّلنَّاسِ﴾ قَالَ: هِيَ رُؤْيَا عَيْنٍ، أُرِيَهَا رَسُولُ اللَّهِ ﷺ لَيْلَةَ أُسْرِيَ بِهِ إِلَى بَيْتِ الْمَقْدِسِ. قَالَ: ﴿وَٱلشَّجَرَةَ ٱلْمَلْعُونَةَ فِى ٱلْقُرْءَانِ﴾ قَالَ: هِيَ شَجَرَةُ الزَّقُّومِ. [رواه البخاري: ٣٨٨٨]

**1583.** Abdullah ibn Abbas رضي الله عنهما Uca Allahın: ***“Meracda*** **sənə göstərdiyimiz mənzərəni və Quranda lənətlənmiş ağacı insanlar üçün yalnız bir imtahan etdik”[2]** ayəsini izah edib demişdir: “Peyğəmbər ﷺ bu ağacı vaxtı ilə (Məkkədən) Qüdsə (oradan da Rəbbinin hüzuruna) getdikdə öz gözü ilə görmüşdür. Quranda lənətlənmiş ağaca gəldikdə isə, bu, Zəqqum[3] ağacıdır.” (əl-Buxari, 3888)

---

[1] Digər hədisdə bu cümlənin tamamı belə rəvayət edilmişdir: “Odur ki, yaxşı əməlin əvəzini on qat verəcəyəm.” Yəni hər bir müsəlman beş vaxt namaz qılmaqla əlli namazın savabını qazanır.

[2] “əl-İsra” surəsi, 60.

[3] Bax: “əs-Saffat” surəsi, 62-66; “əd-Duxan” surəsi, 43-46.

## 25-ci fəsil. Peyğəmbərin ﷺ Aişə ﵂ ilə evlənməsi, Aişənin ﵂ Mədinəyə gəlməsi və Peyğəmbərin ﷺ onu evinə gətirməsi

## ٢٥– باب: تَزْوِيجُ النَّبِيِّ ﷺ عَائِشَةَ وَقُدُومُهَا الْمَدِينَةَ وَبِنَاؤُهُ بِهَا

١٥٨٤ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: تَزَوَّجَنِي النَّبِيُّ ﷺ وَأَنَا بِنْتُ سِتِّ سِنِينَ، فَقَدِمْنَا الْمَدِينَةَ فَنَزَلْنَا فِي بَنِي الْحَارِثِ بْنِ خَزْرَجٍ، فَوُعِكْتُ فَتَمَرَّقَ شَعَرِي فَوَفَى جُمَيْمَةً، فَأَتَتْنِي أُمِّي أُمُّ رُومَانَ وَإِنِّي لَفِي أُرْجُوحَةٍ وَمَعِي صَوَاحِبُ لِي، فَصَرَخَتْ بِي فَأَتَيْتُهَا لاَ أَدْرِي مَا تُرِيدُ بِي فَأَخَذَتْ بِيَدِي حَتَّى أَوْقَفَتْنِي عَلَى بَابِ الدَّارِ، وَإِنِّي لأَنْهَجُ، حَتَّى سَكَنَ بَعْضُ نَفَسِي، ثُمَّ أَخَذَتْ شَيْئًا مِنْ مَاءٍ فَمَسَحَتْ بِهِ وَجْهِي وَرَأْسِي ثُمَّ أَدْخَلَتْنِي الدَّارَ فَإِذَا نِسْوَةٌ مِنَ الأَنْصَارِ فِي الْبَيْتِ فَقُلْنَ عَلَى الْخَيْرِ وَالْبَرَكَةِ، وَعَلَى خَيْرِ طَائِرٍ. فَأَسْلَمَتْنِي إِلَيْهِنَّ فَأَصْلَحْنَ مِنْ شَأْنِي، فَلَمْ يَرُعْنِي إِلاَّ رَسُولُ اللَّهِ ﷺ ضُحًى، فَأَسْلَمَتْنِي إِلَيْهِ، وَأَنَا يَوْمَئِذٍ بِنْتُ تِسْعِ سِنِينَ. [رواه البخاري: ٣٨٩٤]

**1584.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən altı yaşımdan Peyğəmbərin ﷺ deyiklisi[1] idim. Biz Mədinəyə gəldikdə Bəni Haris ibn Xəzrəc qəbiləsində qonaq qaldıq. Bu əsnada mən xəstələndim və mənim saçım tökülməyə başladı, lakin (sağaldıqdan sonra) saçlarım çoxalıb uzandı. (Bir dəfə) mən rəfiqələrimlə yelləncəkdə yellənərkən anam Ummu Ruman gəlib məni çağırdı, mən də onun yanına getdim. Məndən nə istədiyini bilmirdim. O, mənim əlimdən tutub apardı. Nəhayət, gəlib evin qapısına çatdıq. Mən təngənəfəs olmuşdum. Elə ki mən rahat nəfəs almağa başladım, anam bir az su götürüb üzümə və başıma çəkdi, sonra məni evə daxil etdi. Mən o evdə ənsardan olan (bəzi) qadınları gördüm. Onlar (məni görəndə) dedilər: "Xeyirli, bərəkətli və uğurlu olsun!" Sonra anam məni onlara təhvil verdi, onlar da məni (toya) hazırladılar. Səhər Peyğəmbər ﷺ sakitcə mənim yanıma gəldi və qadınlar məni ona təhvil verdilər. O vaxt mənim doqquz yaşım var idi." (əl-Buxari, 3894)

١٥٨٥ – عَنْ عَائِشَةَ ﵂ أَنَّ النَّبِيَّ ﷺ قَالَ لَهَا: «أُرِيتُكِ فِي الْمَنَامِ مَرَّتَيْنِ، أَرَى أَنَّكِ فِي سَرَقَةٍ مِنْ حَرِيرٍ وَيَقُولُ هَذِهِ امْرَأَتُكَ فَاكْشِفْ عَنْهَا فَإِذَا هِيَ أَنْتِ فَأَقُولُ إِنْ يَكُ هَذَا مِنْ عِنْدِ اللَّهِ يُمْضِهِ». [رواه البخاري: ٣٨٩٥]

**1585.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ ona belə demişdir: "Mən iki dəfə səni yuxuda gördüm. Hər ikisində mən sənin (surətini) ipək parça üzərində gördüm və (mənə): "Bu, sənin zövcəndir, aç onun üzünü!"– dedilər. Mən də açıb gördüm ki, bu sənsən. Onda mən dedim: "Əgər bu, Allahdandırsa, Allah onu gerçəyə çevirəcəkdir." (əl-Buxari, 3895)

## 26-cı fəsil. Peyğəmbərin ﷺ və onun əshabələrinin Mədinəyə hicrət etməsi

## ٢٦– باب: هِجْرَةُ النَّبِيِّ ﷺ وَأَصْحَابِهِ إِلَى الْمَدِينَةِ

١٥٨٦ – عَنْ عَائِشَةَ ﵂ زَوْجِ النَّبِيِّ ﷺ قَالَتْ: لَمْ أَعْقِلْ أَبَوَيَّ قَطُّ إِلاَّ وَهُمَا يَدِينَانِ الدِّينَ، وَلَمْ يَمُرَّ عَلَيْنَا يَوْمٌ إِلاَّ يَأْتِينَا فِيهِ رَسُولُ اللَّهِ ﷺ طَرَفَيِ النَّهَارِ بُكْرَةً وَعَشِيَّةً، فَلَمَّا ابْتُلِيَ الْمُسْلِمُونَ خَرَجَ أَبُو بَكْرٍ مُهَاجِرًا نَحْوَ أَرْضِ

[1] Deyikli: uşaqlıqdan adaxlanmış qız ya oğlan.

أَتَيْتُكَ أَسْتَسْلِفُكَ. قَالَ وَأَيْضًا وَاللَّه لَتَمَلُّنَّهُ قَالَ إِنَّا قَد اتَّبَعْنَاهُ فَلاَ نُحِبُّ أَنْ نَدَعَهُ حَتَّى نَنْظُرَ إِلَى أَىِّ شَىْءٍ يَصِيرُ شَأْنُهُ، وَقَدْ أَرَدْنَا أَنْ تُسْلِفَنَا وَسْقًا، أَوْ وَسْقَيْنِ فَقَالَ نَعَمِ ارْهَنُونِى. قَالُوا أَىَّ شَىْءٍ تُرِيدُ قَالَ فَارْهَنُونِى نِسَاءَكُمْ. قَالُوا كَيْفَ نَرْهَنُكَ نِسَاءَنَا وَأَنْتَ أَجْمَلُ الْعَرَب قَالَ فَارْهَنُونِى أَبْنَاءَكُمْ. قَالُوا كَيْفَ نَرْهَنُكَ أَبْنَاءَنَا فَيُسَبُّ أَحَدُهُمْ، فَيُقَالُ رُهِنَ بِوَسْقٍ أَوْ وَسْقَيْنِ. هَذَا عَارٌ عَلَيْنَا، وَلَكِنَّا نَرْهَنُكَ اللأْمَةَ – قَالَ سُفْيَانُ يَعْنِى السِّلاَحَ – فَوَاعَدَهُ أَنْ يَأْتِيَهُ، فَجَاءَهُ لَيْلاً وَمَعَهُ أَبُو نَائِلَةَ وَهُوَ أَخُو كَعْبٍ مِنَ الرَّضَاعَةِ، فَدَعَاهُمْ إِلَى الْحِصْنِ، فَنَزَلَ إِلَيْهِمْ فَقَالَتْ لَهُ امْرَأَتُهُ أَيْنَ تَخْرُجُ هَذِهِ السَّاعَةَ فَقَالَ إِنَّمَا هُوَ مُحَمَّدُ بْنُ مَسْلَمَةَ، وَأَخِى أَبُو نَائِلَةَ. قَالَتْ أَسْمَعُ صَوْتًا كَأَنَّهُ يَقْطُرُ مِنْهُ الدَّمُ. قَالَ إِنَّمَا هُوَ أَخِى مُحَمَّدُ بْنُ مَسْلَمَةَ وَرَضِيعِى أَبُو نَائِلَةَ – إِنَّ الْكَرِيمَ لَوْ دُعِىَ إِلَى طَعْنَةٍ بِلَيْلٍ لأَجَابَ قَالَ وَيُدْخِلُ مُحَمَّدُ بْنُ مَسْلَمَةَ مَعَهُ رَجُلَيْنِ. وَ فِي رِوَايَة: أَبُو عَبْسِ بْنُ جَبْرٍ، وَالْحَارِثُ بْنُ أَوْسٍ وَعَبَّادُ بْنُ بِشْرٍ. قَالَ عَمْرٌو وَجَاءَ مَعَهُ بِرَجُلَيْنِ. فَقَالَ إِذَا مَا جَاءَ فَإِنِّى قَائِلٌ بِشَعَرِهِ فَأَشَمُّهُ، فَإِذَا رَأَيْتُمُونِى اسْتَمْكَنْتُ مِنْ رَأْسِهِ فَدُونَكُمْ فَاضْرِبُوهُ. وَقَالَ مَرَّةً ثُمَّ أُشِمُّكُمْ. فَنَزَلَ إِلَيْهِمْ مُتَوَشِّحًا وَهُوَ يَنْفَحُ مِنْهُ رِيحُ الطِّيبِ، فَقَالَ مَا رَأَيْتُ كَالْيَوْمِ رِيحًا أَىْ أَطْيَبَ. قَالَ عِنْدِى أَعْطَرُ نِسَاءِ الْعَرَبِ وَأَكْمَلُ الْعَرَب. فَقَالَ أَتَأْذَنُ لِى أَنْ أَشَمَّ رَأْسَكَ قَالَ نَعَمْ، فَشَمَّهُ، ثُمَّ أَشَمَّ أَصْحَابَهُ ثُمَّ قَالَ أَتَأْذَنُ لِى قَالَ نَعَمْ. فَلَمَّا اسْتَمْكَنَ مِنْهُ قَالَ دُونَكُمْ. فَقَتَلُوهُ ثُمَّ أَتَوُا النَّبِىَّ ﷺ فَأَخْبَرُوهُ. [رواه البخاري: ٤٠٣٧]

**1609.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ dedi: "Kim Kəb ibn Əşrəfin işini bitirə bilər? Çünki o, Allaha və Onun Rəsuluna əziyyət verir." Muhəmməd ibn Məsləmə ayağa qalxıb dedi: "Ya Rəsulullah, istəyirsən onu mən öldürüm?" Peyğəmbər ﷺ: "Bəli!"– deyə buyurdu. O dedi: "İzn ver bir şey deyim."[1] Peyğəmbər ﷺ buyurdu: "De!" Bundan sonra Muhəmməd ibn Məsləmə (bir neçə əshabə ilə birlikdə Kəbin) yanına gəlib dedi: "Bu adam[2] bizdən sədəqə tələb edir və bizi çox sıxışdırır. Buna görə də mən gəlmişəm səndən borc alım." (Kəb) dedi: "Yenə (sizi bezdirəcək). Vallahi ki, tezliklə sizin onu görməyə gözünüz olmayacaq." (Muhəmməd ibn Məsləmə) dedi: "Artıq biz ona tabe olmuşuq. Odur ki, bu işin nə ilə qurtaracağını görməyincə biz onu tərk etmək istəmirik. İndi isə biz səndən borca bir və ya iki vəsq[3] (ərzaq) götürmək istəyirik." (Kəb) dedi: "Olar, amma gərək mənim yanımda girov qoyasınız." Onlar: "Nə istəyirsən?"- deyə soruşdular. (Kəb) dedi: "Qadınlarınızı yanımda girov qoyun!" Onlar (etiraz edib) dedilər: "Sən ərəblər arasında ən yaraşıqlı kişi olduğun halda biz qadınlarımızı sənin yanında necə girov qoya bilərik?!" (Kəb) dedi: "Onda uşaqlarınızı yanımda girov qoyun!" Onlar (yenə etiraz edib) dedilər: "Biz uşaqlarımızı sənin yanında necə girov qoya bilərik?! Axı, sonra kimsə onları təhqir edib: "(Budur) bir və ya iki vəsq (ərzaq) müqabilində girov qoyulanlar!"– deyəcək, beləliklə də, bizim üzümüzü qara edəcək. (Gəlsənə) biz öz silahlarımızı girov qoyaq." Onlar (bir müddət sonra) görüşməyə vədələşdilər. Gecə (Muhəmməd ibn Məsləmə) Kəbin süd qardaşı Əbu Nailə ilə birlikdə onun yanına gəldi. (Kəb) onları öz istehkamına dəvət etdi və özü də onların yanına endi. Gedəndə arvadı ondan: "Bu vaxt hara gedirsən?"– deyə soruşdu. (Kəb) dedi: "(Gələnlər) ancaq Muhəmməd ibn Məsləmə və mənim (süd) qardaşım Əbu Nailə-

---

[1] Muhəmməd ibn Məsləmə رضي الله عنه Kəbə qarşı hiylə qurmağı qəsd edirdi.

[2] Muhəmməd ibn Məsləmə رضي الله عنه Peyğəmbəri ﷺ qəsd edirdi.

[3] 708-ci hədisin qeydlərinə bax.

dir." Arvad dedi: "Mən bir səs eşidirəm, sanki nədənsə qan damır." (Kəb) dedi: "(Bu) sadəcə Muhəmməd ibn Məsləmə və süd qardaşım Əbu Nailədir. Həqiqətən, alicənab adam gecə vaxtı vurulmağa çağırılmış olsa belə, çağırışa cavab verməlidir."

(Cabir ibn Abdullah) dedi: "Muhəmməd ibn Məsləmə özü ilə bərabər içəri iki nəfər də keçirdi."

(Digər rəvayətdə deyilir ki, bunlar: Əbu Əbs ibn Cəbr, Haris ibn Ovs və Abbad ibn Bişr idi.)

Amr dedi: "Muhəmməd ibn Məsləmə ilə birlikdə iki nəfər gəlmişdi. O, həmin iki nəfərə dedi: "Kəb gələndə mən onun başından tutub onu iyləyəcəyəm. Mənim onun başından bərk yapışdığımı görsəniz dərhal gəlib onun boynunu vurarsınız." (Digər rəvayətdə): "Sonra (onun başını sizə tərəf çəkəcəyəm ki,) siz də iyləyəsiniz."

Kəb əbasına bürünmüş halda onların yanına endi. Ondan xoş ətir qoxusu gəlirdi. (Muhəmməd ibn Məsləmə) dedi: "Mən indiyədək bundan gözəl ətir görməmişəm." Kəb dedi: "(Evimdə) ərəb qadınları arasında ən yaxşı ətir seçən və (ümumiyyətlə) ərəblər içərisində ən ağıllı-kamallı bir (qadın[1]) var." (Muhəmməd ibn Məsləmə) dedi: "İcazə verirsənmi, sənin başını iyləyim?" O: "Bəli!"– dedi. Muhəmməd ibn Məsləmə onun başını iylədi, sonra dostlarına da təklif etdi. Sonra yenə: "İzn verirsənmi, (başını iyləyim)?"– deyə soruşdu. O: "Bəli!"– dedi. Elə ki Muhəmməd ibn Məsləmə onun başından bərk yapışdı, (dostlarına): "Növbə sizindir!"– deyə buyurdu, (onlar da Kəbin üstünə cumub) onu öldürdülər. Sonra da Peyğəmbərin ﷺ yanına gəlib əhvalatı ona danışdılar." (əl-Buxari, 4037)

## 9-cu fəsil. Əbu Rafi Abdullah ibn Əbul Huqeyqin[2] və ya Səllam ibn Əbul Huqeyqin öldürülməsi

## ٩– باب: قَتْلُ أَبى رَافِعٍ عَبْد اللَّه بْنِ أَبِى الْحُقَيْقِ، وَيُقَالُ سَلاَّمُ بْنُ أَبِى الْحُقَيْقِ

١٦١٠ – عَنْ الْبَرَاءِ ﷛ قَالَ بَعَثَ رَسُولُ اللَّه ﷺ إِلَى أَبِى رَافِعٍ الْيَهُودِىِّ رِجَالاً مِنَ الأَنْصَارِ، فَأَمَّرَ عَلَيْهِمْ عَبْدَ اللَّه بْنَ عَتِيك، وَكَانَ أَبُو رَافِعٍ يُؤْذِى رَسُولَ اللَّه ﷺ وَيُعِينُ عَلَيْه، وَكَانَ فِى حِصْنٍ لَهُ بِأَرْضِ الْحِجَازِ، فَلَمَّا دَنَوْا مِنْهُ، وَقَدْ غَرَبَتِ الشَّمْسُ، وَرَاحَ النَّاسُ بِسَرْحِهِمْ فَقَالَ عَبْدُ اللَّه لأَصْحَابِه اجْلِسُوا مَكَانَكُمْ، فَإِنِّى مُنْطَلِقٌ، وَمُتَلَطِّفٌ لِلْبَوَّابِ، لَعَلِّى أَنْ أَدْخُلَ. فَأَقْبَلَ حَتَّى دَنَا مِنَ الْبَابِ ثُمَّ تَقَنَّعَ بِثَوْبِه كَأَنَّهُ يَقْضِى حَاجَةً، وَقَدْ دَخَلَ النَّاسُ، فَهَتَفَ بِه الْبَوَّابُ يَا عَبْدَ اللَّه إِنْ كُنْتَ تُرِيدُ أَنْ تَدْخُلَ فَادْخُلْ، فَإِنِّى أُرِيدُ أَنْ أُغْلِقَ الْبَابَ. فَدَخَلْتُ فَكَمَنْتُ، فَلَمَّا دَخَلَ النَّاسُ أَغْلَقَ الْبَابَ، ثُمَّ عَلَّقَ الأَغَالِيقَ عَلَى وَتَد قَالَ فَقُمْتُ إِلَى الأَقَالِيد، فَأَخَذْتُهَا فَفَتَحْتُ الْبَابَ، وَكَانَ أَبُو رَافِعٍ يُسْمَرُ عِنْدَهُ، وَكَانَ فِى عَلاَلِىَّ لَهُ، فَلَمَّا ذَهَبَ عَنْهُ أَهْلُ سَمَرِه صَعِدْتُ إِلَيْه، فَجَعَلْتُ كُلَّمَا فَتَحْتُ بَابًا أَغْلَقْتُ عَلَىَّ مِنْ دَاخِلٍ، قُلْتُ إِنِ الْقَوْمُ نَذِرُوا بِى لَمْ يَخْلُصُوا إِلَىَّ حَتَّى أَقْتُلَهُ. فَانْتَهَيْتُ إِلَيْه، فَإِذَا هُوَ فِى بَيْتٍ مُظْلِمٍ وَسْطَ عِيَالِه، لاَ أَدْرِى أَيْنَ هُوَ مِنَ الْبَيْتِ فَقُلْتُ يَا أَبَا رَافِعٍ. قَالَ مَنْ هَذَا فَأَهْوَيْتُ نَحْوَ الصَّوْتِ، فَأَضْرِبُهُ ضَرْبَةً

[1] Burada o, öz arvadını qəsd edirdi.

[2] Əbu Abdullah ibn Əbul Huqeyq xeybərlilərin başçılarından olmuş və müsəlmanlara qarşı ittifaq bağlamış müşrikləri Peyğəmbərə ﷺ qarşı qızışdırmışdı.

بِالسَّيْفِ، وَأَنَا دَهِشٌ فَمَا أَغْنَيْتُ شَيْئًا، وَصَاحَ فَخَرَجْتُ مِنَ الْبَيْتِ، فَأَمْكُثُ غَيْرَ بَعِيدٍ ثُمَّ دَخَلْتُ إِلَيْهِ فَقُلْتُ مَا هَذَا الصَّوْتُ يَا أَبَا رَافِعٍ. فَقَالَ لأُمِّكَ الْوَيْلُ، إِنَّ رَجُلاً فِى الْبَيْتِ ضَرَبَنِى قَبْلُ بِالسَّيْفِ، قَالَ فَأَضْرِبُهُ ضَرْبَةً أَثْخَنَتْهُ وَلَمْ أَقْتُلْهُ، ثُمَّ وَضَعْتُ ظُبَةَ السَّيْفِ فِى بَطْنِهِ حَتَّى أَخَذَ فِى ظَهْرِهِ، فَعَرَفْتُ أَنِّى قَتَلْتُهُ، فَجَعَلْتُ أَفْتَحُ الأَبْوَابَ بَابًا بَابًا حَتَّى انْتَهَيْتُ إِلَى دَرَجَةٍ لَهُ، فَوَضَعْتُ رِجْلِى وَأَنَا أُرَى أَنِّى قَدِ انْتَهَيْتُ إِلَى الأَرْضِ فَوَقَعْتُ فِى لَيْلَةٍ مُقْمِرَةٍ، فَانْكَسَرَتْ سَاقِى، فَعَصَبْتُهَا بِعِمَامَةٍ، ثُمَّ انْطَلَقْتُ حَتَّى جَلَسْتُ عَلَى الْبَابِ فَقُلْتُ لاَ أَخْرُجُ اللَّيْلَةَ حَتَّى أَعْلَمَ أَقَتَلْتُهُ فَلَمَّا صَاحَ الدِّيكُ قَامَ النَّاعِى عَلَى السُّورِ فَقَالَ أَنْعَى أَبَا رَافِعٍ تَاجِرَ أَهْلِ الْحِجَازِ. فَانْطَلَقْتُ إِلَى أَصْحَابِى فَقُلْتُ النَّجَاءَ، فَقَدْ قَتَلَ اللَّهُ أَبَا رَافِعٍ. فَانْتَهَيْتُ إِلَى النَّبِىِّ ﷺ فَحَدَّثْتُهُ فَقَالَ: «ابْسُطْ رِجْلَكَ». فَبَسَطْتُ رِجْلِى، فَمَسَحَهَا، فَكَأَنَّهَا لَمْ أَشْتَكِهَا قَطُّ. [رواه البخاري: ٤٠٣٩]

**1610.** Rəvayət edilir ki, Bəra ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ ənsardan bir neçə nəfərə Abdullah ibn Ətiki başçı təyin edib onları yəhudi Əbu Rafinin yanına göndərdi. Əbu Rafi Peyğəmbərə ﷺ əziyyət verir və onun əleyhinə işlər görürdü. O zaman (Əbu Rafi) Hicazdakı istehkamında yaşayırdı. (Əshabələr) ora günəş batdığı və insanlar özlərinin mal-qarasını otlaqdan sürüb (tövləyə) apardığı zaman yaxınlaşdıqda Abdullah yoldaşlarına dedi: "Yerinizdə oturun. Mən gedim baxım, bəlkə qapıçını dilə tutub içəri girə bildim." O gedib qapıya yaxınlaşdıqda libasına büründü və özünü guya iş görürmüş kimi aparmağa başladı. Hamı artıq içəri daxil olmuşdu. Qapıçı (onun xidmətçilərdən olduğunu güman edib) səsləyib dedi: "Ey Allahın bəndəsi, içəri girəcəksənsə, gəl gir! Mən qapıları bağlamaq istəyirəm."

(Abdullah ibn Ətik dedi): "Mən içəri daxil oldum və gizləndim. Hamı içəri daxil olduqda (qapıçı) qapıları bağladı, sonra da açarları bir dirəkdən asdı. (Az keçmədən) mən açarlara yaxınlaşıb onları götürdüm və qapıları açdım." Gecələr Əbu Rafi (havadarları ilə birlikdə) öz otağına yığışıb söhbət edərdi. Həmsöhbətləri onun yanından çıxıb getdikdən sonra, mən onun yanına qalxdım. Mən hər dəfə bir qapını açıb içəri daxil olduqda onu içəri tərəfdən bağlayırdım. Mən (öz-özümə) dedim: "Həmqəbilələri məndən xəbər tutsalar belə, mən onu öldürənədək onlar məni yaxalaya bilməzlər." Beləcə, mən gedib onun yanına çatdım və baxdım ki, o, qaranlıq bir otaqda, ailəsi ilə bir yerdə yatıb. Mən onun otağın harasında olduğunu bilmirdim. Odur ki, (onu çağırıb) dedim: "Ey Əbu Rafi!" O soruşdu: "Kimdir o?" Mən səsə tərəf cumub qılıncla ona bir zərbə endirdim. Amma karıxdığımdan onu əməllicə vura bilmədim. O çığırdı və mən dərhal otaqdan bayıra çıxdım. Bir qədər gözlədikdən sonra içəri girib dedim: "Bu nə səsdi, ey Əbu Rafi?" O dedi: "Anan vayına otursun, indicə bir nəfər bu otaqda məni qılıncla vurdu." Mən ona (yenə) bir zərbə endirdim və onu ağır yaraladım, lakin öldürə bilmədim. Sonra mən qılıncımın ucunu onun qarnına soxub kürəyindən çıxartdım və ancaq bundan sonra onu öldürdüyümü güman etdim. Sonra qapıları bir-bir aça-aça (qaçmağa) başladım. Nəhayət, mən pilləkənlərin bitdiyini, həyətə çatdığımı zənn edib ayağımı qabağa atdım və aylı bir gecədə yerə yıxılıb ayağımı sındırdım. Sonra mən ayağımı sarğı ilə sarıyıb yoluma davam etdim. Axırda gəlib qapının ağzında oturdum və (öz-özümə) dedim: "Bu gecə onun öldüyünü yəqin etməyincə heç yerə gedən deyiləm." (Səhər) xoruz banladıqda ölüm xəbərini elan edən adam barının üstünə çıxıb (qışqıraraq)

dedi: "Hicaz əhlinin taciri Əbu Rafinin ölümünü elan edirəm!" (Bunu eşidəndən) sonra mən yoldaşlarımın yanına gəlib dedim: "Gəlin qaçaq, artıq Allah Əbu Rafini öldürdü!" Mən Peyğəmbərin ﷺ yanına gəlib (başıma gələn) hadisəni ona danışdım. Peyğəmbər ﷺ (mənə): "Ayağını uzat!"– dedi. Mən ayağımı uzatdım və o, əlini mənim ayağıma sürtdü. (Ayağımın ağrısı keçib getdi) sanki o, heç ağrımamışdı." (əl-Buxari, 4039)

## 10-cu fəsil. Uhud döyüşü

## ١٠– باب: غَزْوَةُ أُحُدٍ

١٦١١ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: قَالَ رَجُلٌ لِلنَّبِيِّ ﷺ يَوْمَ أُحُدٍ: أَرَأَيْتَ إِنْ قُتِلْتُ فَأَيْنَ أَنَا قَالَ «فِي الْجَنَّةِ» فَأَلْقَى تَمَرَاتٍ فِي يَدِهِ، ثُمَّ قَاتَلَ حَتَّى قُتِلَ. [رواه البخاري: ٤٠٤٦]

**1611.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, Uhud döyüşündə bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "Bir de görüm, əgər (vuruşub) ölsəm mən harada olacağam?" Peyğəmbər ﷺ buyurdu: "Cənnətdə!" Həmin adam əlindəki xurmaları kənara atdı və son nəfəsinədək vuruşub şəhid oldu." (əl-Buxari, 4046)

## 11-ci fəsil. "O zaman sizlərdən iki dəstə ruhdan düşməyə hazır idilər. Allah isə onların yardımçısı oldu. Qoy möminlər Allaha təvəkkül etsinlər."[1]

## ١١– باب: ﴿إِذْ هَمَّت طَّآئِفَتَانِ مِنكُمْ أَن تَفْشَلَا وَٱللَّهُ وَلِيُّهُمَا ۗ وَعَلَى ٱللَّهِ فَلْيَتَوَكَّلِ ٱلْمُؤْمِنُونَ﴾

١٦١٢ – عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ رضي الله عنه قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَوْمَ أُحُدٍ، وَمَعَهُ رَجُلَانِ يُقَاتِلَانِ عَنْهُ، عَلَيْهِمَا ثِيَابٌ بِيضٌ، كَأَشَدِّ الْقِتَالِ، مَا رَأَيْتُهُمَا قَبْلُ وَلاَ بَعْدُ. [رواه البخاري: ٤٠٥٤]

**1612.** Rəvayət edilir ki, Səd ibn Əbu Vəqqas رضي الله عنه demişdir: "Mən Uhud döyüşündə Peyğəmbəri ﷺ gördüm. Yanında iki nəfər[2] durub onu müdafiə edirdilər. Onların əynində dümağ paltar var idi, özləri də canfəşanlıqla vuruşurdular. Mən onları nə (döyüşdən) əvvəl (görmüşdüm), nə də sonra gördüm." (əl-Buxari, 4054)

١٦١٣ – عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ رضي الله عنه قَالَ: نَثَلَ لِي النَّبِيُّ ﷺ كِنَانَتَهُ يَوْمَ أُحُدٍ فَقَالَ: «ارْمِ فِدَاكَ أَبِي وَأُمِّي». [رواه البخاري: ٤٠٥٥]

**1613.** Rəvayət edilir ki, Səd ibn Əbu Vəqqas رضي الله عنه demişdir: "Uhud döyüşündə Peyğəmbər ﷺ ox qabında olan oxların hamısını mənə verib dedi: "Atam-anam sənə qurban, at!" (əl-Buxari, 4055)

---

[1] "Ali-İmran" surəsi, 122.
[2] Burada mələklər nəzərdə tutulur.

## ١٢ – باب: ﴿لَيْسَ لَكَ مِنَ الْأَمْرِ شَيْءٌ أَوْ يَتُوبَ عَلَيْهِمْ أَوْ يُعَذِّبَهُمْ فَإِنَّهُمْ ظَالِمُونَ﴾

## 12-ci fəsil. “Bu işin sənə aidiyyəti yoxdur. *Allah* ya onların tövbəsini qəbul edər, ya da onlara əzab verər. Çünki onlar zalımdırlar.”[1]

١٦١٤ – عَنْ أَنَسٍ رضي الله عنه شُجَّ النَّبِيُّ ﷺ يَوْمَ أُحُدٍ فَقَالَ: «كَيْفَ يُفْلِحُ قَوْمٌ شَجُّوا نَبِيَّهُمْ». فَنَزَلَتْ: ﴿لَيْسَ لَكَ مِنَ الْأَمْرِ شَيْءٌ﴾ [رواه البخاري: ٤٠٦٩]

**1614.** Ənəs ﷺ rəvayət edir ki, Uhud döyüşündə Peyğəmbər ﷺ (üzündən) yaralandı və: “Peyğəmbərini yaralayan bir millət necə nicat tapa bilər?!”– dedi. Həmin vaxt bu ayə nazil oldu: **“Bu işin sənə aidiyyəti yoxdur...”** (əl-Buxari, 4069)

١٦١٥ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما: أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ إِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ مِنَ الرَّكْعَةِ الآخِرَةِ مِنَ الْفَجْرِ يَقُولُ: «اللَّهُمَّ الْعَنْ فُلاَنًا وَفُلاَنًا وَفُلاَنًا». بَعْدَ مَا يَقُولُ: «سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ». فَأَنْزَلَ اللَّهُ: ﴿لَيْسَ لَكَ مِنَ الْأَمْرِ شَيْءٌ﴾ إِلَى قَوْلِهِ ﴿فَإِنَّهُمْ ظَالِمُونَ﴾. [رواه البخاري: ٤٠٦٩]

**1615.** İbn Ömər ﷺ rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ sübh namazının sonuncu rükətindən qalxıb: “Səmi Allahu limən həmidəh, Rabbənə və ləkəl-həmd!”[2] dedikdən sonra belə dua etdiyini eşitmişdi: “Allahım, filankəsə, filankəsə və filankəsə lənət et!” Həmin vaxt Allah bu ayəni nazil etmişdi: **“Bu işin sənə aidiyyəti yoxdur. *Allah* ya onların tövbəsini qəbul edər, ya da onlara əzab verər. Çünki onlar zalımdırlar.”** (əl-Buxari, 4069)

## ١٣ – باب: قَتْلُ حَمْزَةَ بْنِ عَبْدِ المَطَّلِبِ رضي الله عنه

## 13-cü fəsil. Həmzə ibn Abdul-Muttəlibin ﷺ öldürülməsi

١٦١٦ – عَنْ عُبَيْدِ اللَّهِ بْنِ عَدِيِّ بْنِ الْخِيَارِ أَنَّهُ قَالَ لِوَحْشِيٍّ: أَلاَ تُخْبِرُنَا بِقَتْلِ حَمْزَةَ؟ قَالَ: نَعَمْ، إِنَّ حَمْزَةَ قَتَلَ طُعَيْمَةَ بْنَ عَدِيِّ بْنِ الْخِيَارِ بِبَدْرٍ، فَقَالَ لِي مَوْلاَيَ جُبَيْرُ بْنُ مُطْعِمٍ إِنْ قَتَلْتَ حَمْزَةَ بِعَمِّي فَأَنْتَ حُرٌّ، قَالَ فَلَمَّا أَنْ خَرَجَ النَّاسُ عَامَ عَيْنَيْنِ – وَعَيْنَيْنِ جَبَلٌ بِحِيَالِ أُحُدٍ، بَيْنَهُ وَبَيْنَهُ وَادٍ – خَرَجْتُ مَعَ النَّاسِ إِلَى الْقِتَالِ، فَلَمَّا اصْطَفُّوا لِلْقِتَالِ خَرَجَ سِبَاعٌ فَقَالَ هَلْ مِنْ مُبَارِزٍ قَالَ فَخَرَجَ إِلَيْهِ حَمْزَةُ بْنُ عَبْدِ الْمُطَّلِبِ فَقَالَ: يَا سِبَاعُ يَا ابْنَ أُمِّ أَنْمَارٍ مُقَطِّعَةِ الْبُظُورِ، أَتُحَادُّ اللَّهَ وَرَسُولَهُ ﷺ قَالَ: ثُمَّ شَدَّ عَلَيْهِ فَكَانَ كَأَمْسِ الذَّاهِبِ – قَالَ – وَكَمَنْتُ لِحَمْزَةَ تَحْتَ صَخْرَةٍ فَلَمَّا دَنَا مِنِّي رَمَيْتُهُ بِحَرْبَتِي، فَأَضَعُهَا فِي ثُنَّتِهِ حَتَّى خَرَجَتْ مِنْ بَيْنِ وَرِكَيْهِ – قَالَ – فَكَانَ ذَاكَ الْعَهْدَ بِهِ، فَلَمَّا رَجَعَ النَّاسُ رَجَعْتُ مَعَهُمْ فَأَقَمْتُ بِمَكَّةَ، حَتَّى فَشَا فِيهَا الإِسْلاَمُ، ثُمَّ خَرَجْتُ إِلَى الطَّائِفِ، فَأَرْسَلُوا إِلَى رَسُولِ اللَّهِ ﷺ رَسُولاً، فَقِيلَ لِي إِنَّهُ لاَ يَهِيجُ الرُّسُلَ – قَالَ – فَخَرَجْتُ مَعَهُمْ حَتَّى قَدِمْتُ عَلَى رَسُولِ اللَّهِ ﷺ فَلَمَّا رَآنِي قَالَ: «آنْتَ وَحْشِيٌّ؟» قُلْتُ نَعَمْ. قَالَ: «أَنْتَ قَتَلْتَ حَمْزَةَ؟» قُلْتُ: قَدْ كَانَ مِنَ الأَمْرِ مَا بَلَغَكَ. قَالَ: «فَهَلْ تَسْتَطِيعُ أَنْ تُغَيِّبَ وَجْهَكَ عَنِّي؟» قَالَ فَخَرَجْتُ،

[1] “Ali-İmran” surəsi, 128.

[2] 425-ci hədisin qeydlərinə bax.

فَلَمَّا قُبِضَ رَسُولُ اللَّهِ ﷺ فَخَرَجَ مُسَيْلِمَةُ الْكَذَّابُ قُلْتُ لأَخْرُجَنَّ إِلَى مُسَيْلِمَةَ لَعَلِّي أَقْتُلُهُ فَأُكَافِئَ بِهِ حَمْزَةَ – قَالَ – فَخَرَجْتُ مَعَ النَّاسِ، فَكَانَ مِنْ أَمْرِهِ مَا كَانَ – قَالَ – فَإِذَا رَجُلٌ قَائِمٌ فِي ثَلْمَةِ جِدَارٍ، كَأَنَّهُ جَمَلٌ أَوْرَقُ ثَائِرُ الرَّأْسِ – قَالَ – فَرَمَيْتُهُ بِحَرْبَتِي، فَأَضَعُهَا بَيْنَ ثَدْيَيْهِ حَتَّى خَرَجَتْ مِنْ بَيْنِ كَتِفَيْهِ – قَالَ – وَوَثَبَ إِلَيْهِ رَجُلٌ مِنَ الأَنْصَارِ، فَضَرَبَهُ بِالسَّيْفِ عَلَى هَامَتِهِ. [رواه البخاري: ٤٠٧٢]

**1616.** Rəvayət edilir ki, (bir dəfə) Ubeydullah ibn Adiy ibn Xiyar Vəhşiyə ﷺ dedi: "Bəlkə Həmzəni ﷺ necə öldürdüyünü bizə danışasan?!" (Vəhşi) dedi: "Bəli, Bədr döyüşündə Həmzə Tueymə ibn Adiy ibn Xiyarı öldürmüşdü. Onda ağam Cubeyr ibn Mutim mənə dedi: "Əmimin (qisasını almaq üçün) Həmzəni öldürsən, sən azadsan!" (Nəhayət,) məkkəlilər Ayneyn ilində (döyüşə) çıxdı. (Ayneyn Uhud dağının yanında yerləşən bir dağdır. Bu iki dağı biri-birindən bir vadi ayırırdı.) Mən də hamıyla birgə döyüşə çıxdım. Onlar döyüşmək üçün cərgəbəcərgə düzüldükdən sonra Siba qabağa çıxıb dedi: "(Təkbətək) döyüşmək istəyən varmı?" Bu vaxt Həmzə ibn Abdul-Muttəlib onun qarşısına çıxıb dedi: "Ey Siba, ey qadınları sünnət edən Ummu Ənmarın oğlu, sən Allaha və Onun Rəsuluna ﷺ hədə-qorxumu gəlirsən?" (Bunu deyəndən) sonra Həmzə onun üstünə şığıyıb (onu öldürdü), sanki belə bir adam yox imiş. Mən isə bir qayanın dalında gizlənib Həmzəyə pusqu qurdum. O mənə yaxınlaşanda nizəmlə onu vurdum. Nizə onun qasıq nahiyəsindən girib büzdüm[1] sümüyünün yanından çıxdı. (Bu zərbə) onun işini bitirdi. (Döyüşdən sonra) insanlar geri qayıtdıqda mən də onlarla birlikdə qayıtdım və İslam dini Məkkədə yayılanadək mən orada yaşadım. Sonra mən Taifə getdim. (Taiflilər) Peyğəmbərin ﷺ yanına elçilər göndərmək qərarına gəldilər və: "O, elçilərə dəymir!"– dedilər. Onda mən elçilərlə birlikdə yola çıxdım və nəhayət, gəlib Peyğəmbərin ﷺ yanına çatdım. O məni görəndə dedi: "Vəhşi sənsənmi?" Mən: "Bəli!"– dedim. Soruşdu: "Həmzəni sənmi öldürmüsən?" Dedim: "Hadisə sənə xəbər verildiyi kimi olub." Peyğəmbər ﷺ dedi: "Sən elə edə bilərsənmi ki, mən heç vaxt sənin üzünü görməyim?" Mən (məyus halda) çıxıb getdim. Peyğəmbər ﷺ vəfat etdikdən sonra yalançı Museyləmə[2] meydana çıxdığı zaman mən (öz-özümə) dedim: "Museyləmənin üstünə gedəcəyəm. Ola bilsin ki, mən onu öldürüm və bununla da Həmzəyə görə (qazandığım günahı) yuyum." Mən (hamıyla) birgə (Museyləməyə qarşı döyüşə) çıxdım. Olan oldu, keçən keçdi. Bir də baxdım ki, saçları dağınıq bir adam divarın kəsiyində durub, rəngi də kül rəngində olan dəvənin rənginə çalır. Mən dərhal nizəmlə onu vurdum. Nizə onun köksündən girib kürəyindən çıxdı. Üstəlik ənsardan olan birisi onun üstünə cumub qılıncla onun təpəsinə bir zərbə endirdi." (əl-Buxari, 4072)

## 14-cü fəsil. Uhud döyüşündə Peyğəmbərin ﷺ aldığı yaralar

## ١٤– باب: مَا أَصَابَ النَّبِيَّ ﷺ مِنَ الْجِرَاحِ يَوْمَ أُحُدٍ

١٦١٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «اشْتَدَّ غَضَبُ اللَّهِ عَلَى قَوْمٍ فَعَلُوا بِنَبِيِّهِ – يُشِيرُ إِلَى رَبَاعِيَتِهِ – اشْتَدَّ غَضَبُ اللَّهِ عَلَى رَجُلٍ يَقْتُلُهُ رَسُولُ اللَّهِ ﷺ فِي سَبِيلِ اللَّهِ». [رواه البخاري: ٤٠٧٣]

[1] Büzdüm: onurğanın qurtaracağını təşkil edən sümük.
[2] Bu adam özünü peyğəmbər kimi elan etmiş birisi idi.

**1617.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (əli ilə) ön dişlərinə işarə edib demişdir: "Peyğəmbərinə bunu edən millətə Allah bərk qəzəblənmişdir. Həmçinin, Rəsulullahın Allah yolunda öldürdüyü kimsəyə Allah bərk qəzəblənmişdir." (əl-Buxari, 4073)

## 15-ci fəsil. "Onlar yaralandıqdan sonra da Allahın və Peyğəmbərinin dəvətini qəbul etdilər..."[1]

## ١٥– باب: ﴿ٱلَّذِينَ ٱسۡتَجَابُواْ لِلَّهِ وَٱلرَّسُولِ﴾

١٦١٨ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: لَمَّا أَصَابَ رَسُولَ اللَّهِ ﷺ مَا أَصَابَ يَوْمَ أُحُد، وَانْصَرَفَ عَنْهُ الْمُشْرِكُونَ خَافَ أَنْ يَرْجِعُوا قَالَ: «مَنْ يَذْهَبُ فِى إِثْرِهِمْ». فَانْتَدَبَ مِنْهُمْ سَبْعُونَ رَجُلاً، قَالَ كَانَ فِيهِمْ أَبُو بَكْرٍ وَالزُّبَيْرُ. [رواه البخاري: ٤٠٧٧]

**1618.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Uhud döyüşündə Peyğəmbərin ﷺ başına gələn müsibət baş verdikdən və müşriklər çıxıb getdikdən sonra Peyğəmbər ﷺ onların təkrar qayıdacaqlarından ehtiyat edib dedi: "Kim onların dalınca gedə bilər?" Bu vaxt (əshabələrdən) yetmiş nəfər qabağa çıxdı. Əbu Bəkr və Zubeyr də onların arasında idi." (əl-Buxari, 4077)

## 16-cı fəsil. Xəndək – Əhzab[2] döyüşü

## ١٦– باب: غَزْوَةُ الْخَنْدَقِ وَهِىَ الأَحْزَابُ

١٦١٩ – عَنْ جَابِرٍ رضي الله عنه قَالَ: إِنَّا يَوْمَ الْخَنْدَقِ نَحْفِرُ فَعَرَضَتْ كُدْيَةٌ شَدِيدَةٌ، فَجَاءُوا النَّبِيَّ ﷺ فَقَالُوا هَذِهِ كُدْيَةٌ عَرَضَتْ فِى الْخَنْدَقِ، فَقَالَ: «أَنَا نَازِلٌ». ثُمَّ قَامَ وَبَطْنُهُ مَعْصُوبٌ بِحَجَرٍ، وَلَبِثْنَا ثَلاَثَةَ أَيَّامٍ لاَ نَذُوقُ ذَوَاقًا، فَأَخَذَ النَّبِىُّ ﷺ الْمِعْوَلَ فَضَرَبَ، فَعَادَ كَثِيبًا أَهْيَلَ، فَقُلْتُ يَا رَسُولَ اللَّهِ ائْذَنْ لِى إِلَى الْبَيْتِ. فَقُلْتُ لاِمْرَأَتِى رَأَيْتُ بِالنَّبِىِّ ﷺ شَيْئًا، مَا كَانَ فِى ذَلِكَ صَبْرٌ، فَعِنْدَكِ شَىْءٌ قَالَتْ عِنْدِى شَعِيرٌ وَعَنَاقٌ. فَذَبَحْتُ الْعَنَاقَ وَطَحَنَتِ الشَّعِيرَ، حَتَّى جَعَلْنَا اللَّحْمَ فِى الْبُرْمَةِ، ثُمَّ جِئْتُ النَّبِىَّ ﷺ وَالْعَجِينُ قَدِ انْكَسَرَ، وَالْبُرْمَةُ بَيْنَ الأَثَافِىِّ قَدْ كَادَتْ أَنْ تَنْضَجَ فَقُلْتُ طُعَيِّمٌ لِى، فَقُمْ أَنْتَ يَا رَسُولَ اللَّهِ وَرَجُلٌ أَوْ رَجُلاَنِ. قَالَ: «كَمْ هُوَ؟» فَذَكَرْتُ لَهُ، قَالَ: «كَثِيرٌ طَيِّبٌ». قَالَ: «قُلْ لَهَا لاَ تَنْزِعُ الْبُرْمَةَ وَلاَ الْخُبْزَ مِنَ التَّنُّورِ حَتَّى آتِىَ». فَقَالَ: «قُومُوا». فَقَامَ الْمُهَاجِرُونَ وَالأَنْصَارُ، فَلَمَّا دَخَلَ عَلَى امْرَأَتِهِ قَالَ وَيْحَكِ جَاءَ النَّبِىُّ ﷺ بِالْمُهَاجِرِينَ وَالأَنْصَارِ وَمَنْ مَعَهُمْ. قَالَتْ هَلْ سَأَلَكَ قُلْتُ نَعَمْ. فَقَالَ: «ادْخُلُوا وَلاَ تَضَاغَطُوا». فَجَعَلَ يَكْسِرُ الْخُبْزَ وَيَجْعَلُ عَلَيْهِ اللَّحْمَ، وَيُخَمِّرُ الْبُرْمَةَ وَالتَّنُّورَ إِذَا أَخَذَ مِنْهُ، وَيُقَرِّبُ إِلَى أَصْحَابِهِ ثُمَّ يَنْزِعُ، فَلَمْ يَزَلْ يَكْسِرُ الْخُبْزَ وَيَغْرِفُ حَتَّى شَبِعُوا وَبَقِىَ بَقِيَّةٌ قَالَ: «كُلِى هَذَا وَأَهْدِى، فَإِنَّ النَّاسَ أَصَابَتْهُمْ مَجَاعَةٌ». [رواه البخاري: ٤١٠١]

**1619.** Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Biz Xəndək döyüşündən (əvvəl) xəndək qazarkən qabağımıza olduqca sərt bir qaya parçası çıxdı. (Əshabələr qaya parçasını bölə bilmədiklərindən) Peyğəmbərin ﷺ yanına gəlib dedilər:

[1] "Ali-İmran" surəsi, 172.

[2] Əhzab "dəstələr" deməkdir

"Xəndəkdən bir qaya parçası çıxıb." Peyğəmbər ﷺ: "Mən düşərəm (xəndəyə)"– deyib ayağa qalxdı. Həmin vaxt o, (aclığı hiss etməsin deyə,) qarnına (üç ədəd) daş bağlamışdı. Çünki üç gün idi ki, bizim dilimizə bir şey dəymirdi. Peyğəmbər ﷺ külüng götürüb (qaya parçasına) bir zərbə endirdi və o, dağılıb qum təpəsinə çevrildi. Mən (Peyğəmbərə ﷺ) dedim: "Ya Rəsulullah, evə getməyimə izn verərsənmi?" (Mən evə gəlib) zövcəmə dedim: "Mən Peyğəmbəri ﷺ elə bir halda gördüm ki, buna dözə bilmədim. (Yeməyə) bir şey varmı?" (Zövcəm) dedi: "Evdə bir qədər arpa və bir keçi var." Mən keçini kəsdim, (zövcəm də) arpanı üyütdü. Nəhayət, əti qazana qoyduq. Sonra mən Peyğəmbərin ﷺ yanına getdim. Artıq xəmir mayalanmışdı, qazandakı ət də bişib hazır olurdu. Mən (ona) dedim: "(Evdə) azacıq yeməyimiz var. Dur, ya Rəsulullah, bir-iki nəfər də götür (gedək bizə)." Peyğəmbər ﷺ soruşdu: "Nə qədər yemək var?" Mən ona (yeməyin qədərini) bildirəndə o dedi: "(Nə) çox, (nə) gözəl!" (Sonra əlavə edib) buyurdu: "Zövcənə de ki, mən gələnədək nə qazanın qapağını açsın, nə də çörəyi təndirdən çıxartsın." Bundan sonra (Peyğəmbər ﷺ gəlib əshabələrinə): "Qalxın!"– dedi və mühacirlərlə ənsar qalxıb (onunla getdi)."

Cabir zövcəsinin yanına daxil olduqda qadına dedi: "Ay biçarə, Peyğəmbər ﷺ mühacirlərlə, ənsarla və onların yanında olan kimsələrlə birlikdə gəlir." Qadın (ona) dedi: "O səndən (bir söz) soruşdumu?" (Cabir dedi): "Mən: "Bəli!"– deyə cavab verdim. Peyğəmbər ﷺ (əshabələrinə) dedi: "İçəri keçin, amma basabas salmayın." Peyğəmbər ﷺ çörəkdən qırıb ətdən də götürüb onun arasına qoyduqdan sonra qazanın və təndirin ağzını örtürdü. (O, hər dəfə yeməyi) əshabələrinə verdikdən sonra (qazanın və təndirin ağzını açıb onlar üçün) yemək hazırlayırdı. Əshabələrin hamısı yeyib doyana kimi o, çörəkdən qırıb yeməkdən götürməyə davam etdi. (Yeməyin) qalanı qaldı və Peyğəmbər ﷺ (qadına) buyurdu: "(Götür) bunu, özün də ye, (ehtiyacı olanlara da) ver. Çünki insanlara aclıq üz vermişdir." (əl-Buxari, 4101)

١٦٢٠ – عَنْ سُلَيْمَانَ بْنِ صُرَدٍ ﵁ قَالَ: قَالَ النَّبِيُّ ﷺ يَوْمَ الأَحْزَابِ: «نَغْزُوهُمْ وَلاَ يَغْزُونَنَا». [رواه البخاري: ٤١٠٩]

**1620.** Süleyman ibn Sürəd ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ Əhzab döyüşündə demişdir: "(Bundan sonra ancaq) biz onların üstünə yürüş edəcəyik, onlar isə (bir daha) bizim üstümüzə gəlməyəcəklər." (əl-Buxari, 4109)

١٦٢١ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَقُولُ: «لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ، أَعَزَّ جُنْدَهُ، وَنَصَرَ عَبْدَهُ وَغَلَبَ الأَحْزَابَ وَحْدَهُ، فَلاَ شَيْءَ بَعْدَهُ». [رواه البخاري: ٤١١٤]

**1621.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ deyərdi: "Tək olan Allahdan başqa məbud yoxdur. O Öz əsgərlərini qüdrətli etdi, quluna kömək göstərdi, (düşmənlərdən olan) dəstələri tək Özü məğlub etdi. Ondan sonra heç bir şey yoxdur![1]" (əl-Buxari, 4114)

[1] Duanın transkripsiyası: Lə ilahə illəllahu vəhdəhu, əazzə cundəhu və nəsərə abdəhu və ğələbəl-əhzabə vəhdəhu fələ şeyə bədəhu.

## 17-ci fəsil. Peyğəmbərin ﷺ Əhzab döyüşündən qayıdıb Bəni Qureyzəyə yürüş etməsi

## ١٧– باب: مَرْجَعُ النَّبِيِّ ﷺ مِنَ الأَحْزَابِ وَمَخْرَجُهُ إِلَى بَنِي قُرَيْظَةَ

١٦٢٢ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ قَالَ: نَزَلَ أَهْلُ قُرَيْظَةَ عَلَى حُكْمِ سَعْدِ بْنِ مُعَاذٍ، فَأَرْسَلَ النَّبِيُّ ﷺ إِلَى سَعْدٍ، فَأَتَى عَلَى حِمَارٍ، فَلَمَّا دَنَا مِنَ الْمَسْجِدِ قَالَ لِلأَنْصَارِ: «قُومُوا إِلَى سَيِّدِكُمْ – أَوْ – خَيْرِكُمْ». فَقَالَ: «هَؤُلاَءِ نَزَلُوا عَلَى حُكْمِكَ». فَقَالَ تَقْتُلُ مُقَاتِلَتَهُمْ وَتَسْبِي ذَرَارِيَّهُمْ. قَالَ: «قَضَيْتَ بِحُكْمِ اللَّهِ». وَرُبَّمَا قَالَ: «بِحُكْمِ الْمَلِكِ». [رواه البخاري: ٤١٢١]

**1622.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Qureyzəlilər (məğlub olduqdan sonra) Səd ibn Muazın (onlara dair) qərar verməyinə razılaşdılar. Onda Peyğəmbər ﷺ Sədin yanına adam göndərdi və Səd uzunqulağına minib (onun yanına) gəldi. Səd məscidə yaxınlaşdıqda (Peyğəmbər ﷺ) ənsara dedi: "Qalxın böyüyünüzü (və ya ən xeyirlinizi qarşılayın)!" Sonra (Peyğəmbər ﷺ Sədə) dedi: "Bunlar sənin (onlara dair) qərar verməyinə razıdırlar." Səd dedi: "Onların döyüşçülərini edam edin, qadınlarını və uşaqlarını isə əsir götürün!" Peyğəmbər ﷺ buyurdu: "Sən Allahın hökmü ilə hökm verdin (və ya əl-Malikin hökmü ilə hökm verdin)!" (əl-Buxari, 4121)

## 18-ci fəsil. Zatur-Riqa döyüşü

## ١٨– باب: غَزْوَةُ ذَاتِ الرِّقَاعِ

١٦٢٣ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ أَنَّ النَّبِيَّ ﷺ صَلَّى بِأَصْحَابِهِ فِي الْخَوْفِ فِي غَزْوَةِ السَّابِعَةِ غَزْوَةِ ذَاتِ الرِّقَاعِ. [رواه البخاري: ٤١٢٥]

**1623.** Cabir ibn Abdullah ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ əshabələri ilə birlikdə yeddinci döyüşdə – Zatur-Riqa[1] döyüşündə qorxu namazı qılmışdır. (əl-Buxari, 4125)

١٦٢٤ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: خَرَجْنَا مَعَ النَّبِيِّ ﷺ فِي غَزَاةٍ وَنَحْنُ سِتَّةُ نَفَرٍ بَيْنَنَا بَعِيرٌ نَعْتَقِبُهُ، فَنَقِبَتْ أَقْدَامُنَا وَنَقِبَتْ قَدَمَايَ وَسَقَطَتْ أَظْفَارِي، وَكُنَّا نَلُفُّ عَلَى أَرْجُلِنَا الْخِرَقَ، فَسُمِّيَتْ غَزْوَةَ ذَاتِ الرِّقَاعِ، لِمَا كُنَّا نَعْصِبُ مِنَ الْخِرَقِ عَلَى أَرْجُلِنَا. [رواه البخاري: ٤١٢٨]

**1624.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "(Bir dəfə) biz altı nəfər Peyğəmbərlə ﷺ birlikdə döyüşə çıxdıq. Bizim cəmi bir dəvəmiz var idi ki, onu da biz növbə ilə minirdik. Buna görə də bizim ayaqlarımızın altı sürtüldü. Mənim də ayaqlarım sürtüldü və dırnaqlarım düşdü. Biz ayaqlarımızı sarğı ilə sarıyırdıq. Elə ayaqlarımızı sarğı ilə sarıdığımıza dörə bu döyüş Zatur-Riqa adlandırıldı." (əl-Buxari, 4128)

١٦٢٥ – عَنْ سَهْلِ بْنِ أَبِي حَثْمَةَ، وَكَانَ مِمَّنْ شَهِدَ رَسُولَ اللَّهِ ﷺ يَوْمَ ذَاتِ الرِّقَاعِ صَلَّى صَلاَةَ الْخَوْفِ أَنَّ طَائِفَةً صَفَّتْ مَعَهُ، وَطَائِفَةٌ وُجَاهَ الْعَدُوِّ، فَصَلَّى بِالَّتِي مَعَهُ رَكْعَةً، ثُمَّ ثَبَتَ قَائِمًا، وَأَتَمُّوا لأَنْفُسِهِمْ ثُمَّ انْصَرَفُوا،

[1] Bu sözün hərfi tərcüməsi "yamaqlı" deməkdir. Çox güman ki, bu döyüşdə olan müsəlmanların bayrağı yamaqlı olduğundan döyüşə belə ad verilmişdir.

فَصَفُّوا وُجَاهَ الْعَدُوِّ، وَجَاءَتِ الطَّائِفَةُ الأُخْرَى فَصَلَّى بِهِمِ الرَّكْعَةَ الَّتِي بَقِيَتْ مِنْ صَلاَتِهِ، ثُمَّ ثَبَتَ جَالِسًا، وَأَتَمُّوا لأَنْفُسِهِمْ، ثُمَّ سَلَّمَ بِهِمْ. [رواه البخاري: ٤١٢٩]

**1625.** Peyğəmbərlə ﷺ birlikdə Zatur-Riqa döyüşündə qorxu namazını qılmış Səhl ibn Əbu Həsmə rəvayət etmişdir ki, (əshabələrdən) bir dəstə Peyğəmbərin ﷺ arxasında cərgələrə düzüldü, digəri isə düşmənə qarşı üz tutdu. Peyğəmbər ﷺ arxasında namaza durmuş dəstəyə bir rükət qıldırdıqdan sonra ayağa qalxıb yerində durdu, arxasındakılar isə (ayrı-ayrılıqda) ikinci rükəti tamamladılar. Onlar namazlarını bitirdikdən sonra gedib düşmənə tərəf səf-səf düzüldülər. Sonra o biri dəstə (gəlib Peyğəmbərə ﷺ qoşuldu və Peyğəmbər ﷺ) onlara özünün qalan bir rükətini qıldırdı və oturub gözlədi. Onlar ayağa qalxıb ikinci rükəti tamamladıqdan sonra Peyğəmbər ﷺ salam verib onlarla birlikdə (namazını bitirdi). (əl-Buxari, 4129)

**١٦٢٦** – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رَضِيَ اللَّهُ عَنْهُمَا أَنَّهُ غَزَا مَعَ رَسُولِ اللَّهِ ﷺ قِبَلَ نَجْدٍ، فَلَمَّا قَفَلَ رَسُولُ اللَّهِ ﷺ قَفَلَ مَعَهُ، فَأَدْرَكَتْهُمُ الْقَائِلَةُ فِي وَادٍ كَثِيرِ الْعِضَاهِ، فَنَزَلَ رَسُولُ اللَّهِ ﷺ، وَتَفَرَّقَ النَّاسُ فِي الْعِضَاهِ يَسْتَظِلُّونَ بِالشَّجَرِ، وَنَزَلَ رَسُولُ اللَّهِ ﷺ تَحْتَ سَمُرَةٍ، فَعَلَّقَ بِهَا سَيْفَهُ، قَالَ جَابِرٌ فَنِمْنَا نَوْمَةً، ثُمَّ إِذَا رَسُولُ اللَّهِ ﷺ يَدْعُونَا، فَجِئْنَاهُ فَإِذَا عِنْدَهُ أَعْرَابِيٌّ جَالِسٌ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنَّ هَذَا اخْتَرَطَ سَيْفِي، وَأَنَا نَائِمٌ فَاسْتَيْقَظْتُ، وَهُوَ فِي يَدِهِ صَلْتًا، فَقَالَ لِي مَنْ يَمْنَعُكَ مِنِّي قُلْتُ اللَّهُ. فَهَا هُوَ ذَا جَالِسٌ». ثُمَّ لَمْ يُعَاقِبْهُ رَسُولُ اللَّهِ ﷺ. [رواه البخاري: ٤١٣٥]

**1626.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət etmişdir ki, Peyğəmbər ﷺ Nəcdə yürüş etdiyi zaman o da onunla birlikdə ora getmiş və Peyğəmbər ﷺ geri qayıtdıqda o da onunla birgə geri qayıtmışdır. Günün qızmar vaxtında onlar akasiya ilə dolu bir vadiyə gəlib çatdılar. Peyğəmbər ﷺ dəvəsindən yerə endi. Camaat ağacların kölgəsi altında kölgələnmək üçün ətrafa dağılışdı. Peyğəmbər ﷺ akasiya ağacının altında uzandı, qılıncını da ağacdan asdı.

Cabir dedi: "Biz bir qədər yatdıqdan sonra Peyğəmbər ﷺ bizi (yanına) çağırdı. Biz gəlib gördük ki, onun yanında bir bədəvi oturub. Peyğəmbər ﷺ dedi: "Mən yuxuda ikən bu adam mənim qılıncımı qınından çıxardıb (başımın üstünə) qaldırdı və mən oyandıqda o məndən: "Səni mənim əlimdən kim xilas edə bilər?"– deyə soruşdu. Dedim: "Allah!" (Peyğəmbər ﷺ dedi:) "Budur həmin adam qarşınızdadır." Bundan sonra Peyğəmbər ﷺ onu cəzalandırmadı." (əl-Buxari, 4135)

## ١٩– باب: غَزْوَةُ بَنِي الْمُصْطَلِقِ مِنْ خُزَاعَةَ وَهِيَ غَزْوَةُ الْمُرَيْسِيعِ

## 19-cu fəsil. Xuzaədən olan Bəni Müstələq – Mureysi[1] döyüşü

**١٦٢٧** – عَنْ أَبِي سَعِيدٍ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ: خَرَجْنَا مَعَ رَسُولِ اللَّهِ ﷺ فِي غَزْوَةِ بَنِي الْمُصْطَلِقِ، فَأَصَبْنَا سَبْيًا مِنْ سَبْيِ الْعَرَبِ، فَاشْتَهَيْنَا النِّسَاءَ وَاشْتَدَّتْ عَلَيْنَا الْعُزْبَةُ، وَأَحْبَبْنَا الْعَزْلَ، فَأَرَدْنَا أَنْ نَعْزِلَ، وَقُلْنَا نَعْزِلُ وَرَسُولُ اللَّهِ ﷺ بَيْنَ أَظْهُرِنَا قَبْلَ أَنْ نَسْأَلَهُ فَسَأَلْنَاهُ عَنْ ذَلِكَ فَقَالَ: «مَا عَلَيْكُمْ أَنْ لاَ تَفْعَلُوا، مَا مِنْ نَسَمَةٍ كَائِنَةٍ إِلَى يَوْمِ الْقِيَامَةِ إِلاَّ وَهِيَ كَائِنَةٌ». [رواه البخاري: ٤١٣٨]

[1] Mureysi su quyusunun adıdır.

**1627.** Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Bəni Müstələq qəbiləsinə yürüş etdik və ərəblərdən çoxlu əsir ələ keçirdik. (Həmin vaxt) biz meylimizi qadınlara saldıq. Çünki artıq qadınsız dözə bilmirdik. (Belə olduqda) biz əzl[1] etmək istədik, lakin bir-birimizə dedik: "Peyğəmbər ﷺ aramızda ola-ola, həm də ondan soruşmadan əzl edəcəyik?!" Biz bu haqda Peyğəmbərdən ﷺ soruşduq. O dedi: "Bunu etmək sizə qadağan deyil. Lakin Qiyamət gününədək elə bir canlı ola bilməz ki, dünyaya gəlməsi (əzəldən müəyyən olmuş olsun), amma dünyaya gəlməsin[2]". (əl-Buxari, 4138)

## ٢٠– باب: غَزْوَةُ أَنْمَارٍ

## 20-ci fəsil. (Bəni) **Ənmar döyüşü**

١٦٢٨ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ الأَنْصَارِيِّ رضي الله عنهما قَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ فِي غَزْوَةِ أَنْمَارٍ يُصَلِّي عَلَى رَاحِلَتِهِ، مُتَوَجِّهًا قِبَلَ الْمَشْرِقِ مُتَطَوِّعًا. [رواه البخاري: ٤١٤٠]

**1628.** Rəvayət edilir ki, Cabir ibn Abdullah əl-Ənsari ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ Ənmar döyüşündə dəvəsinin üstündə ikən şərq istiqamətinə üz tutub nafilə namazı qıldığını gördüm." (əl-Buxari, 4140)

## ٢١– باب: غَزْوَةُ الْحُدَيْبِيَةِ. وَقَوْلُ اللَّهِ تَعَالَى: ﴿لَّقَدْ رَضِيَ ٱللَّهُ عَنِ ٱلْمُؤْمِنِينَ إِذْ يُبَايِعُونَكَ تَحْتَ ٱلشَّجَرَةِ﴾

## 21-ci fəsil. Hudeybiyə döyüşü. Uca Allahın "Möminlər ağac altında sənə beyət edərkən Allah onlardan razı qaldı..."[3] sözü

١٦٢٩ – عَنِ الْبَرَاءِ رضي الله عنه قَالَ: تَعُدُّونَ أَنْتُمُ الْفَتْحَ فَتْحَ مَكَّةَ، وَقَدْ كَانَ فَتْحُ مَكَّةَ فَتْحًا، وَنَحْنُ نَعُدُّ الْفَتْحَ بَيْعَةَ الرُّضْوَانِ يَوْمَ الْحُدَيْبِيَةِ. كُنَّا مَعَ النَّبِيِّ ﷺ أَرْبَعَ عَشْرَةَ مِائَةً، وَالْحُدَيْبِيَةُ بِئْرٌ فَنَزَحْنَاهَا، فَلَمْ نَتْرُكْ فِيهَا قَطْرَةً، فَبَلَغَ ذَلِكَ النَّبِيَّ ﷺ فَأَتَاهَا، فَجَلَسَ عَلَى شَفِيرِهَا، ثُمَّ دَعَا بِإِنَاءٍ مِنْ مَاءٍ فَتَوَضَّأَ ثُمَّ مَضْمَضَ وَدَعَا، ثُمَّ صَبَّهُ فِيهَا فَتَرَكْنَاهَا غَيْرَ بَعِيدٍ ثُمَّ إِنَّهَا أَصْدَرَتْنَا مَا شِئْنَا نَحْنُ وَرِكَابَنَا. [رواه البخاري: ٤١٥٠]

**1629.** Rəvayət edilir ki, Bəra ﷺ demişdir: "Doğrudanmı siz Məkkənin fəthini zəfər hesab edirsiniz?! Məkkənin fəthi, doğrudan da, bir zəfərdir. Lakin biz Hudeybiyə günü olan Ridvan beyətini əsl zəfər hesab edirdik. (Həmin gün) biz Peyğəmbərlə ﷺ birlikdə min dörd yüz nəfər idik. Hudeybiyə bir su quyusu idi. Biz onun içindəki suyu axır damlasına kimi çıxartmışdıq. Bu xəbər Peyğəmbərə ﷺ yetişdikdə o, quyunun yanına gəlib onun kənarında oturdu və bir qab su gətizdirib dəstəmaz aldı, sonra ağzını yaxaladı və dua etdi. Bun-

---

[1] Əzl etmək, əslində, işdən, vəzifədən götürmək, çıxarmaq deməkdir. Lakin hədisdə əzl etmək deyildikdə, cinsi əlaqə əsnasında kişi toxumalarının bilərəkdən qadının rəhminə düşməsinin qarşısını almaq nəzərdə tutulur. Əshabələr belə etmək istəyirdilər ki, kənizlər onlardan hamilə qalmasınlar.

[2] Yəni "siz istəsəniz də nütfənin qadının bətninə düşməsinə əngəl ola bilməzsiniz və əgər Allah istəsə, onu yaradacaqdır".

[3] "əl-Fəth" surəsi, 18.

dan sonra qabdakı suyu quyuya boşaltdı. Biz az bir müddət quyunun suyuna dəymədik. Sonra quyu bizə o qədər su verdi ki, bu, həm özümüzə, həm də heyvanlarımıza bəs elədi." (əl-Buxari, 4150)

١٦٣٠ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: قَالَ لَنَا رَسُولُ اللَّهِ ﷺ يَوْمَ الْحُدَيْبِيَةِ: «أَنْتُمْ خَيْرُ أَهْلِ الأَرْضِ». وَكُنَّا أَلْفًا وَأَرْبَعَمِائَةٍ، وَلَوْ كُنْتُ أُبْصِرُ الْيَوْمَ لأَرَيْتُكُمْ مَكَانَ الشَّجَرَةِ. [رواه البخاري: ٤١٥٤]

**1630.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, Hudeybiyə günü Peyğəmbər ﷺ bizə demişdir: "Siz yer sakinlərinin ən xeyirlilərisiniz." (O gün) bizim sayımız min dörd yüz nəfər idi. Əgər indi gözlərim görsəydi, o ağacın yerini sizə göstərərdim." (əl-Buxari, 4154)

١٦٣١ – عَنْ سُوَيْدِ بْنِ النُّعْمَانِ رضي الله عنه، وَكَانَ مِنْ أَصْحَابِ الشَّجَرَةِ، كَانَ رَسُولُ اللَّهِ ﷺ وَأَصْحَابُهُ أُتُوا بِسَوِيقٍ فَلاكُوهُ. [رواه البخاري: ٤١٧٥]

**1631.** Rəvayət edilir ki, ağac altında beyət etmiş əshabələrdən olmuş Suveyd ibn Nomən رضي الله عنه demişdir: "Peyğəmbərə ﷺ və onun əshabələrinə sıyıq gətirdilər və onlar onu yedilər." (əl-Buxari, 4175)

١٦٣٢ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رضي الله عنه أَنَّهُ كَانَ يَسِيرُ مَعَ النَّبِيِّ ﷺ فَسَأَلَهُ عُمَرُ بْنُ الْخَطَّابِ عَنْ شَيْءٍ فَلَمْ يُجِبْهُ رَسُولُ اللَّهِ ﷺ ثُمَّ سَأَلَهُ فَلَمْ يُجِبْهُ، ثُمَّ سَأَلَهُ فَلَمْ يُجِبْهُ وَقَالَ عُمَرُ بْنُ الْخَطَّابِ ثَكِلَتْكَ أُمُّكَ يَا عُمَرُ، نَزَرْتَ رَسُولَ اللَّهِ ﷺ ثَلاثَ مَرَّاتٍ، كُلُّ ذَلِكَ لاَ يُجِيبُكَ. قَالَ عُمَرُ فَحَرَّكْتُ بَعِيرِي ثُمَّ تَقَدَّمْتُ أَمَامَ الْمُسْلِمِينَ، وَخَشِيتُ أَنْ يَنْزِلَ فِيَّ قُرْآنٌ، فَمَا نَشِبْتُ أَنْ سَمِعْتُ صَارِخًا يَصْرُخُ بِي فَقُلْتُ لَقَدْ خَشِيتُ أَنْ يَكُونَ نَزَلَ فِيَّ قُرْآنٌ. وَجِئْتُ رَسُولَ اللَّهِ ﷺ فَسَلَّمْتُ عَلَيْهِ فَقَالَ: «لَقَدْ أُنْزِلَتْ عَلَيَّ اللَّيْلَةَ سُورَةٌ لَهِيَ أَحَبُّ إِلَيَّ مِمَّا طَلَعَتْ عَلَيْهِ الشَّمْسُ، ثُمَّ قَرَأَ: ﴿إِنَّا فَتَحْنَا لَكَ فَتْحًا مُّبِينًا﴾. [رواه البخاري: ٤١٧٧]

**1632.** Ömər ibn Xəttabdan رضي الله عنه rəvayət edilir ki, (bir dəfə) o, Peyğəmbərlə ﷺ birlikdə gecə səfərdə olarkən ondan bir şey haqqında soruşmuş, Peyğəmbər ﷺ isə ona cavab verməmişdi. Sonra o (yenə) soruşmuş, Peyğəmbər ﷺ isə ona cavab verməmişdi. O bir daha soruşmuş, Peyğəmbər ﷺ isə ona cavab verməmişdi. Sonra Ömər ibn Xəttab (öz-özünə) demişdi: "Anan vayına otursun, ay Ömər! Sən Peyğəmbərə ﷺ üç kərə sual verdin, heç birinə də ondan cavab almadın."

Ömər dedi: "Mən dəvəmi sürüb müsəlmanların önünə keçdim və barəmdə ayə nazil olacağından qorxdum. Az keçmədən bir nəfərin məni səsləyib çağırdığını eşitdim və (öz-özümə) dedim: "(Axı, demişdim ki,) barəmdə ayə nazil olacağından qorxuram." Mən Peyğəmbərin ﷺ yanına gəlib ona salam verdim. O buyurdu: "Bu gecə mənə elə bir surə nazil oldu ki, o mənim üçün üstündə günəş doğan hər bir şeydən daha əzizdir." Sonra (bu surəni) oxudu: **"Həqiqətən, Biz sənə aydın bir zəfər bəxş etdik ki,..."**[1] (əl-Buxari, 4177)

١٦٣٣ – عَنْ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ وَمَرْوَانَ بْنِ الْحَكَمِ رضي الله عنهما يَزِيدُ أَحَدُهُمَا عَلَى صَاحِبِهِ قَالاَ خَرَجَ النَّبِيُّ ﷺ عَامَ الْحُدَيْبِيَةِ فِي بِضْعَ عَشْرَةَ مِائَةً مِنْ أَصْحَابِهِ، فَلَمَّا أَتَى ذَا الْحُلَيْفَةِ قَلَّدَ الْهَدْيَ، وَأَشْعَرَهُ، وَأَحْرَمَ مِنْهَا بِعُمْرَةٍ،

---

[1] "əl-Fəth" surəsi.

وَبَعَثَ عَيْنًا لَهُ مِنْ خُزَاعَةَ، وَسَارَ النَّبِيُّ ﷺ حَتَّى كَانَ بِغَدِيرِ الأَشْطَاطِ، أَتَاهُ عَيْنُهُ قَالَ إِنَّ قُرَيْشًا جَمَعُوا لَكَ جُمُوعًا، وَقَدْ جَمَعُوا لَكَ الأَحَابِيشَ، وَهُمْ مُقَاتِلُوكَ وَصَادُّوكَ عَنِ الْبَيْتِ وَمَانِعُوكَ. فَقَالَ: «أَشِيرُوا أَيُّهَا النَّاسُ عَلَيَّ، أَتَرَوْنَ أَنْ أَمِيلَ إِلَى عِيَالِهِمْ وَذَرَارِيِّ هَؤُلاَءِ الَّذِينَ يُرِيدُونَ أَنْ يَصُدُّونَا عَنِ الْبَيْتِ، فَإِنْ يَأْتُونَا كَانَ اللَّهُ عَزَّ وَجَلَّ قَدْ قَطَعَ عَيْنًا مِنَ الْمُشْرِكِينَ، وَإِلاَّ تَرَكْنَاهُمْ مَحْرُوبِينَ». قَالَ أَبُو بَكْرٍ يَا رَسُولَ اللَّهِ، خَرَجْتَ عَامِدًا لِهَذَا الْبَيْتِ، لاَ تُرِيدُ قَتْلَ أَحَدٍ وَلاَ حَرْبَ أَحَدٍ، فَتَوَجَّهْ لَهُ، فَمَنْ صَدَّنَا عَنْهُ قَاتَلْنَاهُ. قَالَ: «امْضُوا عَلَى اسْمِ اللَّهِ». [رواه البخاري: ٤١٧٨-٤١٧٩]

**1633.** Rəvayət edilir ki, Misvər ibn Məxrəmə və Mərvan ibn Həkəm ﵄ bir-birinin rəvayətini tamamlayaraq demişlər: “Hudeybiyə səfərində Peyğəmbər ﷺ mindən yuxarı əshabəsi ilə birlikdə yola düşmüşdü. O gedib zül-Hüleyfəyə çatdıqda qurbanlıq heyvanlarının boynuna ip bağladı və onlara nişan qoydu, özü də ümrə niyyəti ilə ihrama girdi və xuzaəlilərdən olan kəşfiyyatçısını (irəli) göndərdi. Sonra Peyğəmbər ﷺ yola düşdü və Əştat quyusuna gəlib çatanadək yoluna davam etdi. (Bu vaxt) kəşfiyyatçısı onun yanına gəlib dedi: “Qureyşlilər sənə qarşı adam toplayıblar. Onlar həbəşiləri də sənə qarşı toplayıblar. Onlar sənə qarşı vuruşacaq, səni Kəbəyə buraxmayacaq və sənə mane olacaqlar.” Peyğəmbər ﷺ buyurdu: “Mənə məsləhət verin, ey insanlar! Nə deyirsiniz, bizə Kəbəyə yaxınlaşmağa mane olan bu adamların ailələrini və uşaqlarını qırmağa dəyərmi? Əgər onlar bizim üstümüzə gəlirlərsə, Qüdrətli və Böyük Allah müşriklərin (üstünə göndərdiyimiz) kəşfiyyatçını onlardan gizlədər, əks təqdirdə isə biz onlara aman verməzik.” Əbu Bəkr dedi: “Ey Allahın elçisi! Axı, sən (müqəddəs) Evi ziyarət etmək məqsədilə yola çıxmısan, nə bir kimsəni öldürmək, nə də bir kimsə ilə vuruşmaq istəyin olmayıb. Odur ki, yoluna davam et. Kim bizə Kəbəyə getməyə mane olarsa, onunla vuruşarıq.” Peyğəmbər ﷺ buyurdu: “Allahın adı ilə yolunuza davam edin!” (əl-Buxari, 4178-4179)

١٦٣٤ – عَنْ نَافِعٍ قَالَ: إِنَّ النَّاسَ يَتَحَدَّثُونَ أَنَّ ابْنَ عُمَرَ ﵄ أَسْلَمَ قَبْلَ عُمَرَ ﵁، وَلَيْسَ كَذَلِكَ، وَلَكِنْ عُمَرُ يَوْمَ الْحُدَيْبِيَةِ أَرْسَلَ عَبْدَ اللَّهِ إِلَى فَرَسٍ لَهُ عِنْدَ رَجُلٍ مِنَ الأَنْصَارِ يَأْتِي بِهِ لِيُقَاتِلَ عَلَيْهِ، وَرَسُولُ اللَّهِ ﷺ يُبَايِعُ عِنْدَ الشَّجَرَةِ، وَعُمَرُ لاَ يَدْرِي بِذَلِكَ، فَبَايَعَهُ عَبْدُ اللَّهِ، ثُمَّ ذَهَبَ إِلَى الْفَرَسِ، فَجَاءَ بِهِ إِلَى عُمَرَ، وَعُمَرُ يَسْتَلْئِمُ لِلْقِتَالِ، فَأَخْبَرَهُ أَنَّ رَسُولَ اللَّهِ ﷺ يُبَايِعُ تَحْتَ الشَّجَرَةِ – قَالَ – فَانْطَلَقَ فَذَهَبَ مَعَهُ حَتَّى بَايَعَ رَسُولَ اللَّهِ ﷺ، فَهِيَ الَّتِي يَتَحَدَّثُ النَّاسُ أَنَّ ابْنَ عُمَرَ أَسْلَمَ قَبْلَ عُمَرَ. [رواه البخاري: ٤١٨٦]

**1634.** Rəvayət edilir ki, Nafi demişdir: “İnsanlar deyirlər ki, (Abdullah) ibn Ömər ﵄ Ömərdən qabaq müsəlman olmuşdur. (Lakin) bu belə deyil. Hudeybiyə günü Ömər Abdullahı ənsardan olan bir nəfərin yanında saxladığı öz atının dalınca göndərdi ki, onu minib döyüşə qatılsın. Həmin vaxt (əshabələr) ağac altında Peyğəmbərə ﷺ beyət edirdilər, Ömərin isə bundan xəbəri yox idi. Abdullah beyət etdikdən sonra atın dalınca gedib onu Ömərin yanına gətirdi. Bu vaxt Ömər döyüşə hazırlaşırdı. Abdullah ona (əshabələrin) ağac altında Peyğəmbərə ﷺ beyət etdiklərini xəbər verdi. Bundan sonra Ömər gedib Peyğəmbərə ﷺ beyət etdi. Abdullah da onun yanında idi. Elə buna görə də camaat deyir ki, (Abdullah) ibn Ömər Ömərdən qabaq müsəlman olmuşdur.” (əl-Buxari, 4186)

١٦٣٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ أَبِى أَوْفَى رضي الله عنهما قَالَ كُنَّا مَعَ النَّبِيِّ ﷺ حِينَ اعْتَمَرَ فَطَافَ فَطُفْنَا مَعَهُ، وَصَلَّى وَصَلَّيْنَا مَعَهُ، وَسَعَى بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ، فَكُنَّا نَسْتُرُهُ مِنْ أَهْلِ مَكَّةَ، لاَ يُصِيبُهُ أَحَدٌ بِشَيْءٍ. [رواه البخاري: ٤١٨٨]

**1635.** Rəvayət edilir ki, Abdullah ibn Əbu Əufə رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ ümrə ziyarətini yerinə yetirərkən[1] biz onun yanında idik. O, təvaf etdi, biz də onunla birlikdə təvaf etdik, o, namaz qıldı, biz də onunla bərabər namaz qıldıq, o, Səfa və Mərvə dağları arasında səy etdi. (Ziyarət əsnasında) biz onu məkkəlilərdən qoruyurduq ki, kimsə ona xətər toxundura bilməsin." (əl-Buxari, 4188)

## 22-ci fəsil. Zatul-Qərəd döyüşü

## ٢٢– باب: غَزْوَةُ ذَاتِ الْقَرَدِ

١٦٣٦ – عَنْ سَلَمَةَ بْنَ الأَكْوَعِ رضي الله عنه قَالَ: خَرَجْتُ قَبْلَ أَنْ يُؤَذَّنَ بِالأُولَى، وَكَانَتْ لِقَاحُ رَسُولِ اللَّهِ ﷺ تَرْعَى بِذِى قَرَدٍ – قَالَ – فَلَقِيَنِى غُلاَمٌ لِعَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ فَقَالَ أُخِذَتْ لِقَاحُ رَسُولِ اللَّهِ ﷺ قُلْتُ مَنْ أَخَذَهَا قَالَ غَطَفَانُ. قَالَ فَصَرَخْتُ ثَلاَثَ صَرَخَاتٍ – يَا صَبَاحَاهْ – قَالَ فَأَسْمَعْتُ مَا بَيْنَ لاَبَتَىِ الْمَدِينَةِ، ثُمَّ انْدَفَعْتُ عَلَى وَجْهِى حَتَّى أَدْرَكْتُهُمْ وَقَدْ أَخَذُوا يَسْتَقُونَ مِنَ الْمَاءِ، فَجَعَلْتُ أَرْمِيهِمْ بِنَبْلِى، وَكُنْتُ رَامِيًا، وَأَقُولُ:

أَنَا ابْنُ الأَكْوَعْ، الْيَوْمُ يَوْمُ الرُّضَّعْ.

وَأَرْتَجِزُ حَتَّى اسْتَنْقَذْتُ اللِّقَاحَ مِنْهُمْ، وَاسْتَلَبْتُ مِنْهُمْ ثَلاَثِينَ بُرْدَةً، قَالَ: وَجَاءَ النَّبِيُّ ﷺ وَالنَّاسُ فَقُلْتُ: يَا نَبِيَّ اللَّهِ قَدْ حَمَيْتُ الْقَوْمَ الْمَاءَ وَهُمْ عِطَاشٌ، فَابْعَثْ إِلَيْهِمُ السَّاعَةَ. فَقَالَ: «يَا ابْنَ الأَكْوَعِ، مَلَكْتَ فَأَسْجِحْ». قَالَ ثُمَّ رَجَعْنَا وَيُرْدِفُنِى رَسُولُ اللَّهِ ﷺ عَلَى نَاقَتِهِ حَتَّى دَخَلْنَا الْمَدِينَةَ. [رواه البخاري: ٤١٩٤]

**1636.** Rəvayət edilir ki, Sələmə ibn Əkva رضي الله عنه demişdir: "(Bir dəfə) hələ sübh namazının azanı verilməmişdən əvvəl mən (Mədinədən) yola çıxdım. Peyğəmbərin ﷺ sağmal dəvələri (adətən) zu Qərəd deyilən yerdə otlayardı. (Yolda) mən Abdur-Rəhman ibn Aufun köləsinə rast gəldim. O dedi: "Peyğəmbərin ﷺ sağmal dəvələrini aparıblar." Mən: "Kim aparıb?"– deyə soruşdum. Dedi: "Ğətəfanlılar." Mən (o dəqiqə) üç dəfə uca səslə: "Köməyə gəlin!"– deyə qışqırıb Mədinədəkiləri xəbərdar etdim. Sonra heç yana dönmədən (atımı dördnala çapıb) ğətəfanlılara çatdım və gördüm ki, onlar, quyudan su içirlər. Mən dərhal onları ox atəşinə tutdum və ox ata-ata bu sözləri oxudum:

*Əkvanın oğluyam mən,*
*Ölüm günüdür bu gün.*

Mən bu sözləri deyə-deyə onlardan nəinki Peyğəmbərin ﷺ sağmal dəvələrini, (hətta əlavə olaraq) otuz bürüncək də götürdüm. Peyğəmbər ﷺ əshabələri ilə birlikdə (ora) gəldikdə mən dedim: "Ey Allahın peyğəmbəri, bu adamlar susamışlar, mən onlara su içməyə imkan verməyib başlarının üstünü aldım. (Məsləhətdirsə,) indi onların dalınca adam göndər." Peyğəmbər ﷺ buyurdu: "Ey Əkvanın oğlu, sən onları üstələdin. (İndi isə) mülayim davran." Sonra biz geri qayıtdıq. Mədinəyədək mən dəvənin üstündə, Peyğəmbərin ﷺ tərkində getdim." (əl-Buxari, 4194)

---

[1] Hədisdə Peyğəmbərin ﷺ hicrətin 7-ci ilində zilqədə ayında yerinə yetirdiyi ümrə nəzərdə tutulur.

## 23-cü fəsil. Xeybər döyüşü

## ٢٣- باب: غَزْوَةُ خَيْبَرَ

١٦٣٧ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ قَالَ: خَرَجْنَا مَعَ النَّبِيِّ ﷺ إِلَى خَيْبَرَ فَسِرْنَا لَيْلاً، فَقَالَ رَجُلٌ مِنَ الْقَوْمِ لِعَامِرٍ يَا عَامِرُ أَلاَ تُسْمِعُنَا مِنْ هُنَيْهَاتِكَ. وَكَانَ عَامِرٌ رَجُلاً شَاعِرًا فَنَزَلَ يَحْدُو بِالْقَوْمِ يَقُولُ:

اللَّهُمَّ لَوْلاَ أَنْتَ مَا اهْتَدَيْنَا وَلاَ تَصَدَّقْنَا وَلاَ صَلَّيْنَا
فَاغْفِرْ فِدَاءً لَكَ مَا أَبْقَيْنَا وَثَبِّتِ الأَقْدَامَ إِنْ لاَقَيْنَا
وَأَلْقِيَنْ سَكِينَةً عَلَيْنَا إِنَّا إِذَا صِيحَ بِنَا أَبَيْنَا
وَبِالصِّيَاحِ عَوَّلُوا عَلَيْنَا

فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «مَنْ هَذَا السَّائِقُ». قَالُوا عَامِرُ بْنُ الأَكْوَعِ. قَالَ: «يَرْحَمُهُ اللَّهُ». قَالَ رَجُلٌ مِنَ الْقَوْمِ وَجَبَتْ يَا نَبِيَّ اللَّهِ، لَوْلاَ أَمْتَعْتَنَا بِهِ. فَأَتَيْنَا خَيْبَرَ، فَحَاصَرْنَاهُمْ حَتَّى أَصَابَتْنَا مَخْمَصَةٌ شَدِيدَةٌ، ثُمَّ إِنَّ اللَّهَ تَعَالَى فَتَحَهَا عَلَيْهِمْ، فَلَمَّا أَمْسَى النَّاسُ مَسَاءَ الْيَوْمِ الَّذِى فُتِحَتْ عَلَيْهِمْ أَوْقَدُوا نِيرَانًا كَثِيرَةً، فَقَالَ النَّبِيُّ ﷺ: «مَا هَذِهِ النِّيرَانُ عَلَى أَىِّ شَىْءٍ تُوقِدُونَ». قَالُوا عَلَى لَحْمٍ. قَالَ «عَلَى أَىِّ لَحْمٍ». قَالُوا لَحْمِ حُمُرِ الإِنْسِيَّةِ. قَالَ النَّبِيُّ ﷺ: «أَهْرِيقُوهَا وَاكْسِرُوهَا». فَقَالَ رَجُلٌ يَا رَسُولَ اللَّهِ، أَوْ نُهَرِيقُهَا وَنَغْسِلُهَا قَالَ: «أَوْ ذَاكَ». فَلَمَّا تَصَافَّ الْقَوْمُ كَانَ سَيْفُ عَامِرٍ قَصِيرًا فَتَنَاوَلَ بِهِ سَاقَ يَهُودِىٍّ لِيَضْرِبَهُ، وَيَرْجِعُ ذُبَابُ سَيْفِهِ، فَأَصَابَ عَيْنَ رُكْبَةِ عَامِرٍ، فَمَاتَ مِنْهُ قَالَ فَلَمَّا قَفَلُوا، قَالَ سَلَمَةُ رَآنِى رَسُولُ اللَّهِ ﷺ وَهُوَ آخِذٌ بِيَدِى، قَالَ: «مَا لَكَ». قُلْتُ لَهُ فِدَاكَ أَبِى وَأُمِّى، زَعَمُوا أَنَّ عَامِرًا حَبِطَ عَمَلُهُ. قَالَ النَّبِيُّ ﷺ: «كَذَبَ مَنْ قَالَهُ، إِنَّ لَهُ لأَجْرَيْنِ – وَجَمَعَ بَيْنَ إِصْبَعَيْهِ – إِنَّهُ لَجَاهِدٌ مُجَاهِدٌ قَلَّ عَرَبِىٌّ مَشَى بِهَا مِثْلَهُ». [رواه البخاري: ٤١٩٦]

**1637.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ﷺ demişdir: "(Bir dəfə) biz (Mədinədən) Xeybərə yola düşdük və gecə ikən əshabələrdən biri Amirə dedi: "Ey Amir, bəlkə bizim üçün öz şeirlərindən nə isə oxuyasan!" Amir (tanınmış) bir şair idi. (Bu xahişdən) sonra o, miniyindən yerə enib ritmlə[1] bu sözləri oxumağa başladı:

*Olmasaydın, ey Allah, düz yola gəlməzdik biz,*
*Nə sədəqə verərdik, nə namaz qılardıq biz.*
*Qurban olarıq Sənə, bağışla səhvimizi,*
*Düşmən görünsə bizə, sabit et qədəmmizi.*
*İndisə bir təskinlik, Özün nazil et bizə,*
*Haqqa çağrılsaq əgər, qaçmaq yaraşmaz bizə,*
*Onlar "İmdad!" deyərək, xitab edirlər bizə.*

Allahın elçisi ﷺ soruşdu: "(Heyvanları) qovan bu (adam) kimdir?" (Əshabələr): "Amir ibn Əkvadır"– deyə cavab verdilər. Peyğəmbər ﷺ dedi: "Allah ona rəhm etsin!" Orada olanlardan biri dedi: "(Onun şəhid olması) vacib oldu, ey Allahın peyğəmbəri!" Nə olaydı, biz sənin sayəndə ondan faydalanardıq. Sonra Biz Xeybərə getdik və xeybərliləri mühasirəyə aldıq. Çox keçmədən bizə bərk aclıq üz verdi, (lakin) sonra Uca Allah bizə onların üzərində zəfər çaldırdı. Xeybərlilərin üzərində zəfər çalınan günün axşamı (əshabələr) çoxlu tonqallar qaladılar. Peyğəmbər ﷺ soruşdu: "Bu nə tonqallardır? Onları nə üçün yandırmısınız?" (Əshabələr) dedilər: "Ət (bişirmək) üçün." Peyğəmbər ﷺ soruşdu: "Hansı ət?" Onlar dedilər: "Ev eşşəyinin əti." Pey-

[1] Ritm – səs, nitq və s. ünsürlərinin təkrarlanmasında müəyyən ardıcıllıq, müntəzəmlik,

ğəmbər ﷺ buyurdu: "Bişirdiyinizi (yerə) boşaldın, qazanları da sındırın!" Bir nəfər dedi: "Ya Rəsulullah, yeməyi boşaldıb qazanları yusaq necə?" (Peyğəmbər ﷺ) dedi: "Elə də olar."

(Döyüş başladıqda) əsgərlər səf-səf düzülmüşdülər. Amirin qılıncı qısa idi. Amir öz qılıncıyla bir yəhudinin ayağından vurmaq istədikdə qılıncın tiyəsi qayıdıb Amirin diz qapağını kəsdi və bu (yaradan da) o, öldü. Biz (Mədinəyə) qayıtdıqda Peyğəmbər ﷺ mənim (kədərli olduğumu) gördü və əlimdən tutub dedi: "Nə olub sənə?" Mən ona dedim: "Atam-anam sənə qurban. Bəziləri iddia edirlər ki, Amirin əməlləri puç olmuşdur.[1]" Peyğəmbər ﷺ dedi: "Bunu deyən yalan söyləmişdir. Çünki o, ikiqat savab qazandı. – Bunu deyəndə o, iki barmağını bir-birinə birləşdirdi. – Həqiqətən də, o, (haqq uğrunda) mübarizə aparan bir mücahid idi. Ərəblərdən onun kimi (fədakarlıq) göstərən azdır." (əl-Buxari, 4196)

١٦٣٨ – عَنْ أَنَسٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ أَتَى خَيْبَرَ لَيْلاً، وَكَانَ إِذَا أَتَى قَوْمًا بِلَيْلٍ لَمْ يُغِرْ بِهِمْ حَتَّى يُصْبِحَ، فَلَمَّا أَصْبَحَ خَرَجَتِ الْيَهُودُ بِمَسَاحِيهِمْ وَمَكَاتِلِهِمْ، فَلَمَّا رَأَوْهُ قَالُوا مُحَمَّدٌ وَاللَّهِ، مُحَمَّدٌ وَالْخَمِيسُ، فَقَالَ النَّبِيُّ ﷺ: «خَرِبَتْ خَيْبَرُ، إِنَّا إِذَا نَزَلْنَا بِسَاحَةِ قَوْمٍ فَسَاءَ صَبَاحُ الْمُنْذَرِينَ». [رواه البخاري: ٤١٩٧]

**1638.** Ənəs ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ Xeybərə gecə vaxtı gəlib çatdı. O, (hər hansı) bir qövmün yaşadığı yerə gecə vaxtı gəlib çatsaydı, səhərədək onların üstünə hücum etməzdi[2]. Səhər açıldıqda yəhudilər bellərini və zənbillərini götürüb bayıra çıxdılar. Onlar Peyğəmbəri ﷺ görəndə dedilər: "Vallahi, (bu,) Muhəmməddir! Vallahi, (bu,) Muhəmməd və onun beşliyidir[3]". Peyğəmbər ﷺ dedi: "Xeybər dağıldı! Həqiqətən, biz (fasiq) qövmün yurduna daxil olduqda, qorxudulanların sabahı necə də pis olar!" (əl-Buxari, 4197)

١٦٣٩ – عَنْ أَبِي مُوسَى الأَشْعَرِيِّ ﷺ قَالَ: لَمَّا غَزَا رَسُولُ اللَّهِ ﷺ خَيْبَرَ – أَوْ قَالَ لَمَّا تَوَجَّهَ رَسُولُ اللَّهِ ﷺ أَشْرَفَ النَّاسُ عَلَى وَادٍ، فَرَفَعُوا أَصْوَاتَهُمْ بِالتَّكْبِيرِ اللَّهُ أَكْبَرُ اللَّهُ أَكْبَرُ، لاَ إِلَهَ إِلاَّ اللَّهُ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «ارْبَعُوا عَلَى أَنْفُسِكُمْ، إِنَّكُمْ لاَ تَدْعُونَ أَصَمَّ وَلاَ غَائِبًا، إِنَّكُمْ تَدْعُونَ سَمِيعًا قَرِيبًا وَهُوَ مَعَكُمْ». وَأَنَا خَلْفَ دَابَّةِ رَسُولِ اللَّهِ ﷺ فَسَمِعَنِي وَأَنَا أَقُولُ لاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ، فَقَالَ لِي: «يَا عَبْدَ اللَّهِ بْنَ قَيْسٍ». قُلْتُ لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ. قَالَ: «أَلاَ أَدُلُّكَ عَلَى كَلِمَةٍ مِنْ كَنْزٍ مِنْ كُنُوزِ الْجَنَّةِ». قُلْتُ بَلَى يَا رَسُولَ اللَّهِ فِدَاكَ أَبِي وَأُمِّي. قَالَ: «لاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ». [رواه البخاري: ٤٢٠٥]

**1639.** Rəvayət edilir ki, Əbu Musa əl-Əşari ﷺ demişdir: "Peyğəmbər ﷺ Xeybərə yürüş etdikdə (yaxud o istiqamətə getdikdə) və insanlar (hər hansı bir) vadiyə yaxınlaşdıqda uca səslə təkbir gətirib deyərdilər: "Allahu Əkbər, Allahu Əkbər, lə ilahə illəllah." Peyğəmbər ﷺ buyurdu: "Özünüzə yazığınız gəlsin! Axı, siz kar və uzaqda olan (bir tanrını) çağırmırsınız. Həqiqətən, O, Eşidəndir, Yaxındır və O, (həmişə) sizinlədir." Həmin vaxt mən Peyğəmbərin ﷺ dəvəsinin arxa tərəfində idim. O mənim: "Lə həulə və lə quvvətə illə billəh[4]"–

[1] Bəziləri güman edirdilər ki, Amir ﷺ özünü öldürmüş və bununla da əməllərini puç etmişdir.

[2] Peyğəmbər ﷺ sübh namazının vaxtını gözləyərdi və əgər azan səsi eşidənədək onlara hücum etməzdi.

[3] Burada "beşlik" deyildikdə müsəlman ordusunun beş dəstədən – sağ və sol cinahda, habelə öndə, arxada və ortada mövqe tutmuş dəstələrdən ibarət olduğu nəzərdə tutulur.

[4] Qüdrət və güc yalnız Allaha məxsusdur!

dediyimi eşitdi və mənə belə buyurdu: "Ey Abdullah ibn Qeys!" Dedim: "Hüzurundayam, ya Rəsulullah!" Dedi: "Cənnət xəzinələrindən sayılan bir kəlməni[1] sənə öyrədimmi?" Dedim: "Bəli, ya Rəsulullah, atam-anam sənə qurban!" Peyğəmbər ﷺ buyurdu: "Lə həulə və lə quvvətə illə billəh!" (əl-Buxari, 4205)

١٦٤٠ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ السَّاعِدىِّ ﷺ أَنَّ رَسُولَ اللَّه ﷺ الْتَقَى هُوَ وَالْمُشْرِكُونَ فَاقْتَتَلُوا، فَلَمَّا مَالَ رَسُولُ اللَّه ﷺ إِلَى عَسْكَرِه، وَمَالَ الآخَرُونَ إِلَى عَسْكَرِهِمْ، وَفِى أَصْحَاب رَسُول اللَّه ﷺ رَجُلٌ لاَ يَدَعُ لَهُمْ شَاذَّةً وَلاَ فَاذَّةً إِلاَّ اتَّبَعَهَا، يَضْرِبُهَا بِسَيْفِه، فَقِيلَ مَا أَجْزَأَ مِنَّا الْيَوْمَ أَحَدٌ كَمَا أَجْزَأَ فُلاَنٌ. فَقَالَ رَسُولُ اللَّه ﷺ: «أَمَا إِنَّهُ مِنْ أَهْلِ النَّارِ». فَقَالَ رَجُلٌ مِنَ الْقَوْمِ أَنَا صَاحِبُهُ. قَالَ فَخَرَجَ مَعَهُ كُلَّمَا وَقَفَ وَقَفَ مَعَهُ، وَإِذَا أَسْرَعَ أَسْرَعَ مَعَهُ – قَالَ – فَجُرِحَ الرَّجُلُ جُرْحًا شَدِيدًا، فَاسْتَعْجَلَ الْمَوْتَ، فَوَضَعَ سَيْفَهُ بِالأَرْضِ وَذُبَابَهُ بَيْنَ ثَدْيَيْه، ثُمَّ تَحَامَلَ عَلَى سَيْفِه، فَقَتَلَ نَفْسَهُ، فَخَرَجَ الرَّجُلُ إِلَى رَسُول اللَّه ﷺ فَقَالَ أَشْهَدُ أَنَّكَ رَسُولُ اللَّه قَالَ: «وَمَا ذَاكَ». قَالَ الرَّجُلُ الَّذِى ذَكَرْتَ آنِفًا أَنَّهُ مِنْ أَهْلِ النَّارِ، فَأَعْظَمَ النَّاسُ ذَلِكَ، فَقُلْتُ أَنَا لَكُمْ بِه. فَخَرَجْتُ فِى طَلَبِه، ثُمَّ جُرِحَ جُرْحًا شَدِيدًا، فَاسْتَعْجَلَ الْمَوْتَ، فَوَضَعَ نَصْلَ سَيْفِه فِى الأَرْضِ وَذُبَابُهُ بَيْنَ ثَدْيَيْه، ثُمَّ تَحَامَلَ عَلَيْه، فَقَتَلَ نَفْسَهُ. فَقَالَ رَسُولُ اللَّه ﷺ عِنْدَ ذَلِكَ: «إِنَّ الرَّجُلَ لَيَعْمَلُ عَمَلَ أَهْلِ الْجَنَّة، فِيمَا يَبْدُو لِلنَّاسِ، وَهُوَ مِنْ أَهْلِ النَّارِ، وَإِنَّ الرَّجُلَ لَيَعْمَلُ عَمَلَ أَهْلِ النَّارِ، فِيمَا يَبْدُو لِلنَّاسِ، وَهُوَ مِنْ أَهْلِ الْجَنَّةِ».
وَ فِي رِوَايَةٍ عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ: «قُمْ يَا فُلاَنُ فَأَذِّنْ أَنَّهُ لاَ يَدْخُلُ الْجَنَّةَ إِلاَّ مُؤْمِنٌ، إِنَّ اللَّهَ يُؤَيِّدُ الدِّينَ بِالرَّجُلِ الْفَاجِرِ». [رواه البخاري: ٤٢٠٢–٤٢٠٣]

**1640.** Səhl ibn Səd əs-Saidi ﷺ rəvayət edir ki, (yürüşlərin birində) Peyğəmbər ﷺ (və onun əshabələri) müşriklərlə üz-üzə gəlib döyüşməyə başladılar. (Bir müddətdən sonra) Peyğəmbər ﷺ öz düşərgəsinə, müşriklər də öz düşərgələrinə çəkildilər. Peyğəmbərin ﷺ əshabələri arasında elə birisi var idi ki, (döyüşdə) heç bir fürsəti əldən verməmiş, çatdığı hər kəsi qılıncdan keçirib qətlə yetirmişdi. (Bəziləri) dedilər: "Bu gün bizim heç birimiz filankəs kimi döyüşmədi." Peyğəmbər ﷺ buyurdu: "(Filankəsə) gəlincə, o, Cəhənnəm əhlindəndir!" Əshabələrdən biri: "Bu gün mən onu izləyəcəyəm"– dedi və onun dalınca düşdü. Adam hər dayandıqda, əshabə onunla bərabər dayanar, tez-tez getdikdə isə (ona çatmağa) tələsərdi. Sonra həmin adam ölümcül yaralandı və canını (əzab-əziyyətdən) qurtarsın deyə qılıncının qəbzəsini yerə dayadı, tiyəsini də sinəsinə dirədi, sonra da özünü qılıncının üstünə yıxdı. (Bu hadisədən sonra) əshabə Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Mən şahidlik edirəm ki, sən Allahın Elçisisən!" Peyğəmbər ﷺ soruşdu: "Nə olub ki?" (Əshabə) dedi: "Bayaq sən bir adamın Cəhənnəm əhlindən olduğunu söylədin və bu, hamını heyrətə saldı. Onda mən (öz-özümə): "Mən onun barəsində sizə (bir xəbər) gətirərəm"– dedim və həmin adamı izləməyə başladım. Bu əsnada həmin adam ölümcül yaralandı və canını (əzab-əziyyətdən) tez qurtarmaq üçün qılıncının qəbzəsini yerə dayadı, tiyəsini də sinəsinə dirədi, sonra da özünü qılıncının üstünə yıxaraq canına qəsd etdi." Bunu eşidəndə Peyğəm-

---

[1] Burada Peyğəmbərin ﷺ cümləyə kəlmə deməsi qeyri-adi bir şey deyildir. Belə ki, ərəbcə bir və ya bundan da artıq cümlələrə "kəlmə" və ya "söz" demək olar. Uca Allah buyurur: **"Nəhayət, onlardan birinə ölüm gəldiyi zaman deyər: "Ey Rəbbim! Məni geri qaytar. Bəlkə, tərk etdiyim yaxşı əməlləri *indi* edəm". Xeyr! Onun bu dedikləri ancaq *boş* bir sözdür"** ("əl-Muminun" surəsi, 99-100).

bər ﷺ buyurdu: “Həqiqətən, insanlara kimsənin Cənnət əhlinin əməli kimi bir əməl etdiyi görünə bilər, (halbuki) həmin adam Cəhənnəm əhlindəndir. Həmçinin onlara kimsənin Cəhənnəm əhlinin əməli kimi bir əməl etdiyi görünə bilər, halbuki həmin adam Cənnət əhlindəndir.”

Digər rəvayətdə Əbu Hureyra ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “Qalx, ey filankəs, elan et ki, Cənnətə yalnız mömin girəcəkdir. Allah bu dini günahkar bir adamın vasitəsilə də olsa belə, (qoruyub) saxlayar.” (əl-Buxari, 4202-4203)

١٦٤١ – عَنْ يَزِيدَ بْنِ أَبِي عُبَيْدٍ قَالَ: رَأَيْتُ أَثَرَ ضَرْبَةٍ فِي سَاقِ سَلَمَةَ، فَقُلْتُ يَا أَبَا مُسْلِمٍ، مَا هَذِهِ الضَّرْبَةُ قَالَ هَذِهِ ضَرْبَةٌ أَصَابَتْنِي يَوْمَ خَيْبَرَ، فَقَالَ النَّاسُ أُصِيبَ سَلَمَةُ، فَأَتَيْتُ النَّبِيَّ ﷺ فَنَفَثَ فِيهِ ثَلاَثَ نَفَثَاتٍ، فَمَا اشْتَكَيْتُهَا حَتَّى السَّاعَةِ. [رواه البخاري: ٤٢٠٦]

**1641.** Rəvayət edilir ki, Yezid ibn Əbu Ubeyd demişdir: “(Bir dəfə) mən Sələmənin ayağında çapıq gördüm və (ondan): “Ey Əbu Muslim, bu nə çapıqdır?”– deyə soruşdum.” Dedi: “Bu, Xeybər günü aldığım zərbənin izidir. (O vaxt) camaat: “Sələmə yaralandı”– dedi. (Bundan sonra) mən Peyğəmbərin ﷺ yanına gəldim və o mənim yarama üç dəfə üfürdü. Bu vaxtadək ayağım hələ məni narahat etməyib.” (əl-Buxari, 4206)

١٦٤٢ – عَنْ أَنَسٍ ﷺ يَقُولُ أَقَامَ النَّبِيُّ ﷺ بَيْنَ خَيْبَرَ وَالْمَدِينَةِ ثَلاَثَ لَيَالٍ يُبْنَى عَلَيْهِ بِصَفِيَّةَ، فَدَعَوْتُ الْمُسْلِمِينَ إِلَى وَلِيمَتِهِ، وَمَا كَانَ فِيهَا مِنْ خُبْزٍ وَلاَ لَحْمٍ، وَمَا كَانَ فِيهَا إِلاَّ أَنْ أَمَرَ بِلاَلاً بِالأَنْطَاعِ فَبُسِطَتْ، فَأَلْقَى عَلَيْهَا التَّمْرَ وَالأَقِطَ وَالسَّمْنَ، فَقَالَ الْمُسْلِمُونَ إِحْدَى أُمَّهَاتِ الْمُؤْمِنِينَ، أَوْ مَا مَلَكَتْ يَمِينُهُ قَالُوا إِنْ حَجَبَهَا فَهْيَ إِحْدَى أُمَّهَاتِ الْمُؤْمِنِينَ، وَإِنْ لَمْ يَحْجُبْهَا فَهْيَ مِمَّا مَلَكَتْ يَمِينُهُ. فَلَمَّا ارْتَحَلَ وَطَّأَ لَهَا خَلْفَهُ، وَمَدَّ الْحِجَابَ. [رواه البخاري: ٤٢١٣]

**1642.** Ənəs ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ Səfiyyə[1] ilə evlənmək üçün üç gecə Xeybərlə Mədinə arasında qaldı. Həmin vaxt mən müsəlmanları onun toyuna çağırdım. (Ziyafət verməyə) nə çörək var idi, nə də ət. Peyğəmbərin ﷺ əmri ilə Bilal yerə süfrə sərdi və onun üzərinə (xeyli) xurma, qurut və yağ qoydu. Müsəlmanlar (bir-birilərindən) soruşdular: “Görəsən, o, möminlərin analarından[2] biri olacaq, yoxsa cariyə olaraq qalacaq?” (Cavabında da) dedilər: “Əgər (Peyğəmbər ﷺ) ona hicab geyməyi əmr edərsə, demək, o, möminlərin analarından biridir, yox, əgər bunu əmr etməzsə, onda o, cariyə kimi qalacaq.”

(Peyğəmbər ﷺ) yola düşdükdə (öz dəvəsinin üstündə) qadın üçün yer hazırladı və ona hicab geyindirdi. (əl-Buxari, 4213)

١٦٤٣ – عَنْ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ مُتْعَةِ النِّسَاءِ يَوْمَ خَيْبَرَ، وَعَنْ أَكْلِ الْحُمُرِ الإِنْسِيَّةِ. [رواه البخاري: ٤٢١٦]

---

[1] Səfiyyə bint Huyey ﷺ Bəni Nədir qəbiləsinin başçılarından birinin – Kinanə ibn Əbu Huqeyqin arvadı olmuşdur. Qadın əsir düşdükdən sonra Peyğəmbər ﷺ onu azad etmiş, sonra da onunla evlənmişdir.

[2] Uca Allah buyurur: **“Peyğəmbər möminlərə onların özlərindən daha yaxındır. Zövcələri isə möminlərin analarıdır...”** “əl-Əhzab” surəsi, 6.

**1643.** Əli ibn Əbu Talib ﷺ rəvayət etmişdir ki, Xeybər günü Peyğəmbər ﷺ siğəni[1] və ev eşşəyinin ətini yeməyi haram buyurmuşdur." (əl-Buxari, 4216)

**١٦٤٤ –** عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: قَسَمَ رَسُولُ اللَّهِ ﷺ يَوْمَ خَيْبَرَ لِلْفَرَسِ سَهْمَيْنِ، وَلِلرَّاجِلِ سَهْمًا. [رواه البخاري: ٤٢٢٨]

**1644.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Xeybər günü Peyğəmbər ﷺ (qənimətlərdən) at üçün iki pay, sahibinə isə bir pay ayırdı.[2]" (əl-Buxari, 4228)

**١٦٤٥ –** عَنْ أَبِي مُوسَى رضي الله عنه قَالَ: بَلَغَنَا مَخْرَجُ النَّبِيِّ ﷺ وَنَحْنُ بِالْيَمَنِ، فَخَرَجْنَا مُهَاجِرِينَ إِلَيْهِ أَنَا، وَأَخَوَانِ لِي أَنَا أَصْغَرُهُمْ، أَحَدُهُمَا أَبُو بُرْدَةَ، وَالآخَرُ أَبُو رُهْمٍ – إِمَّا قَالَ بِضْعٌ وَإِمَّا قَالَ – فِي ثَلاَثَةٍ وَخَمْسِينَ أَوِ اثْنَيْنِ وَخَمْسِينَ رَجُلاً مِنْ قَوْمِي، فَرَكِبْنَا سَفِينَةً، فَأَلْقَتْنَا سَفِينَتُنَا إِلَى النَّجَاشِيِّ بِالْحَبَشَةِ، فَوَافَقْنَا جَعْفَرَ بْنَ أَبِي طَالِبٍ فَأَقَمْنَا مَعَهُ حَتَّى قَدِمْنَا جَمِيعًا، فَوَافَقْنَا النَّبِيَّ ﷺ حِينَ افْتَتَحَ خَيْبَرَ، وَكَانَ أُنَاسٌ مِنَ النَّاسِ يَقُولُونَ لَنَا – يَعْنِي لأَهْلِ السَّفِينَةِ – سَبَقْنَاكُمْ بِالْهِجْرَةِ، وَدَخَلَتْ أَسْمَاءُ بِنْتُ عُمَيْسٍ، وَهِيَ مِمَّنْ قَدِمَ مَعَنَا، عَلَى حَفْصَةَ زَوْجِ النَّبِيِّ ﷺ زَائِرَةً، وَقَدْ كَانَتْ هَاجَرَتْ إِلَى النَّجَاشِيِّ فِيمَنْ هَاجَرَ، فَدَخَلَ عُمَرُ عَلَى حَفْصَةَ وَأَسْمَاءُ عِنْدَهَا، فَقَالَ عُمَرُ حِينَ رَأَى أَسْمَاءَ مَنْ هَذِهِ قَالَتْ أَسْمَاءُ بِنْتُ عُمَيْسٍ. قَالَ عُمَرُ الْحَبَشِيَّةُ هَذِهِ الْبَحْرِيَّةُ هَذِهِ قَالَتْ أَسْمَاءُ نَعَمْ. قَالَ سَبَقْنَاكُمْ بِالْهِجْرَةِ، فَنَحْنُ أَحَقُّ بِرَسُولِ اللَّهِ ﷺ مِنْكُمْ. فَغَضِبَتْ وَقَالَتْ كَلاَّ وَاللَّهِ، كُنْتُمْ مَعَ رَسُولِ اللَّهِ ﷺ يُطْعِمُ جَائِعَكُمْ، وَيَعِظُ جَاهِلَكُمْ، وَكُنَّا فِي دَارِ أَوْ فِي أَرْضِ الْبُعَدَاءِ الْبُغَضَاءِ بِالْحَبَشَةِ، وَذَلِكَ فِي اللَّهِ وَفِي رَسُولِهِ ﷺ وَايْمُ اللَّهِ، لاَ أَطْعَمُ طَعَامًا، وَلاَ أَشْرَبُ شَرَابًا حَتَّى أَذْكُرَ مَا قُلْتَ لِرَسُولِ اللَّهِ ﷺ وَنَحْنُ كُنَّا نُؤْذَى وَنُخَافُ، وَسَأَذْكُرُ ذَلِكَ لِلنَّبِيِّ ﷺ وَأَسْأَلُهُ، وَاللَّهِ لاَ أَكْذِبُ وَلاَ أَزِيغُ وَلاَ أَزِيدُ عَلَيْهِ. فَلَمَّا جَاءَ النَّبِيُّ ﷺ قَالَتْ يَا نَبِيَّ اللَّهِ إِنَّ عُمَرَ قَالَ كَذَا وَكَذَا. قَالَ: «فَمَا قُلْتِ لَهُ». قَالَتْ قُلْتُ لَهُ كَذَا وَكَذَا. قَالَ «لَيْسَ بِأَحَقَّ بِي مِنْكُمْ، وَلَهُ وَلأَصْحَابِهِ هِجْرَةٌ وَاحِدَةٌ، وَلَكُمْ أَنْتُمْ أَهْلَ السَّفِينَةِ هِجْرَتَانِ». [رواه البخاري: ٤٢٣٠-٤٢٣١]

**1645.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "Biz Yəməndə olarkən Peyğəmbərin ﷺ (Məkkədən Mədinəyə hicrət etdiyini) bizə xəbər verdilər. (Bu xəbəri eşidəndə) mən yaşca məndən böyük iki qardaşımla – Əbu Burdə və Əbu Ruhm ilə birlikdə həmqəbilələrimizdən olan əlli üç, yaxud əlli iki nəfərdən ibarət bir dəstəyə qoşulub (Mədinəyə) hicrət etdik. Biz bir gəmiyə mindik və bu gəmi bizi Həbəşistana – Nəcaşinin yanına apardı. Orada biz Cəfər ibn Əbu Talibə rast gəldik və hamımız (Mədinəyə) qayıdanadək onun yanında qaldıq. (Nəhayət,) Peyğəmbər ﷺ Xeybəri fəth etdiyi zaman biz ona yetişdik. O vaxt bəzi adamlar bizə – yəni gəmi ilə gələnlərə – deyirdilər: "Biz sizdən qabaq hicrət etmişik." (Bu ərəfədə) bizimlə birgə (Mədinəyə) gəlmiş, habelə (vaxtı ilə) Nəcaşinin (məmləkətinə) hicrət etmiş kimsələrlə bərabər hicrət etmiş Əsma bint Umeys Peyğəmbərin ﷺ zövcəsi Həfsəni ziyarət etdi. Əsma Həfsənin evində ikən Ömər onun yanına gəldi və Əsmanı görcək: "Bu kimdir?"– deyə soruşdu. Həfsə: "Əsma bint Umeysdir"– dedi. Ömər soruşdu: "Həbəşistanda (yaşamış) və gəmi ilə hicrət etmiş (qadın) budur?" Əsma: "Bəli!"– deyə cavab verdi. Ömər dedi: "Biz sizdən əvvəl hicrət etmişik. Odur ki, biz Peyğəmbərə ﷺ sizdən daha yaxınıq." (Bunu eşidəndə) Əsma qəzəblə-

---

[1] Siğə: müvəqqəti nikah. İslamaqədərki dövrdə bu nikah növü ərəblər arasında yayılmışdı. Lakin hədisdən göründüyü kimi Peyğəmbər ﷺ bunu haram buyurmuşdur.

[2] 1239-cu hədisin qeydlərinə bax.

nib dedi: "Yox, vallahi ki, (sən düz danışmırsan). Siz Peyğəmbərin ﷺ yanında olarkən, o, sizin aranızdakı acların qarnını doydurarkən, cahillərinizə öyüd-nəsihət verərkən, biz Həbəşistanda – uzaq və cansıxıcı bir diyarda yaşamışıq. Bütün bunları Allahın və Onun peyğəmbərinin xatirinə etmişik. Vallahi, sənin dediklərini Allahın Elşisinə ﷺ xəbər verməyincə, mən nə yemək yeyəcəyəm, nə də su içəcəyəm. (Həbəşistanda) bizim xətrimizə dəyirdilər, özümüz də qorxu içində yaşayırdıq. Mən bunu Peyğəmbərə ﷺ deyəcəyəm və bu haqda ondan soruşacağam. And olsun Allaha, mən nə yalan danışacağam, nə (haqdan) uzaqlaşacağam, nə də buna (bir şey) əlavə edəcəyəm." Peyğəmbər ﷺ gəldikdə Əsma dedi: "Ey Allahın peyğəmbəri, Ömər belə-belə dedi." Peyğəmbər ﷺ soruşdu: "Sən ona nə cavab verdin?" Əsma dedi: "Mən ona bunu-bunu dedim." Peyğəmbər ﷺ buyurdu: "O mənə sizdən daha yaxın ola bilməz, axı o və onun yol yoldaşları cəmi bir kərə hicrət etmişlər. Siz isə, ey gəmi əhli, iki dəfə hicrət etmisiniz." (əl-Buxari, 4230-4231)

١٦٤٦ – عَنْ أَبِي مُوسَى ﵁ قَالَ النَّبِيُّ ﷺ: «إِنِّي لَأَعْرِفُ أَصْوَاتَ رُفْقَةِ الأَشْعَرِيِّينَ بِالْقُرْآنِ، حِينَ يَدْخُلُونَ بِاللَّيْلِ، وَأَعْرِفُ مَنَازِلَهُمْ مِنْ أَصْوَاتِهِمْ بِالْقُرْآنِ بِاللَّيْلِ، وَإِنْ كُنْتُ لَمْ أَرَ مَنَازِلَهُمْ حِينَ نَزَلُوا بِالنَّهَارِ، وَمِنْهُمْ حَكِيمٌ، إِذَا لَقِيَ الْخَيْلَ – أَوْ قَالَ الْعَدُوَّ – قَالَ لَهُمْ إِنَّ أَصْحَابِي يَأْمُرُونَكُمْ أَنْ تَنْظُرُوهُمْ». [رواه البخاري: ٤٢٣٢]

**1646.** Əbu Musa (əl-Əşari) ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əşari camaatı gecələr (evlərinə) daxil olub Quran oxuduğu zaman mən onları səslərindən tanıyıram. Onlar gecə vaxtı Quran oxuduqları zaman mən onların səsi ilə hansı evdə qaldıqlarını bilirəm. Halbuki onların gündüz vaxtı hansı evdə qaldıqlarını görmürəm. Onların arasında Həkim adlı birisi var. O, (həmişə) atlılara və ya düşmənə rast gəldikdə onlara deyərdi: "Dostlarım sizə onları gözləməyinizi əmr edirlər." (əl-Buxari, 4232)

١٦٤٧ – عَنْ أَبِي مُوسَى ﵁ قَالَ: قَدِمْنَا عَلَى النَّبِيِّ ﷺ بَعْدَ أَنِ افْتَتَحَ خَيْبَرَ، فَقَسَمَ لَنَا، وَلَمْ يَقْسِمْ لِأَحَدٍ لَمْ يَشْهَدِ الْفَتْحَ غَيْرَنَا. [رواه البخاري: ٤٢٣٣]

**1647.** Rəvayət edilir ki, Əbu Musa ﵁ demişdir: "Xeybər fəth edildikdən sonra biz Peyğəmbərin ﷺ yanına gəldikdə o, (qənimətlərdən) bizə pay ayırdı və bizdən başqa bu qələbənin şahidi olmayan heç bir kəsə pay ayırmadı." (əl-Buxari, 4233)

## 24-cü fəsil. (Sonradan) yerinə yetirilən ümrə (ziyarəti)

## ٢٤– باب: عُمْرَةُ الْقَضَاءِ

١٦٤٨ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ: تَزَوَّجَ النَّبِيُّ ﷺ مَيْمُونَةَ وَهُوَ مُحْرِمٌ، وَبَنَى بِهَا وَهُوَ حَلَالٌ وَمَاتَتْ بِسَرِفَ. [رواه البخاري: ٤٢٥٨]

**1648.** Rəvayət edilir ki, ibn Abbas ﵄ demişdir: "Peyğəmbər ﷺ ihramda ikən Meymunə ilə nikah bağladı və ihramdan çıxdıqdan sonra onun yanına girdi. (Meymunəyə gəlincə,) o, Sərifə[1] deyilən yerdə vəfat etmişdir." (əl-Buxari, 4258)

[1] Məkkə yaxınlığında yer.

## 25-ci fəsil. Şam diyarında baş vermiş Mutə döyüşü

## ٢٥– باب: غَزْوَةُ مُوتَةَ مِنْ أَرْضِ الشَّأْمِ

١٦٤٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنه قَالَ: أَمَّرَ رَسُولُ اللَّهِ ﷺ فِى غَزْوَةِ مُوتَةَ زَيْدَ بْنَ حَارِثَةَ، فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «إِنْ قُتِلَ زَيْدٌ فَجَعْفَرٌ، وَإِنْ قُتِلَ جَعْفَرٌ فَعَبْدُ اللَّهِ بْنُ رَوَاحَةَ». قَالَ عَبْدُ اللَّهِ كُنْتُ فِيهِمْ فِى تِلْكَ الْغَزْوَةِ فَالْتَمَسْنَا جَعْفَرَ بْنَ أَبِى طَالِبٍ، فَوَجَدْنَاهُ فِى الْقَتْلَى، وَوَجَدْنَا مَا فِى جَسَدِهِ بِضْعًا وَتِسْعِينَ مِنْ طَعْنَةٍ وَرَمْيَةٍ. [رواه البخاري: ٤٢٦١]

**1649.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: "Peyğəmbər ﷺ Mutəyə[1] göndərdiyi orduya Zeyd ibn Harisəni başçı təyin etmiş və demişdir: "Zeyd öldürülsə, Cəfəri, Cəfər də öldürülsə, Abdullah ibn Rəvahanı (başçı təyin edərsiniz)."

Abdullah ibn Ömər demişdir: "Bu döyüşdə mən də həmin orduda idim. (Döyüşdən sonra) biz Cəfər ibn Əbu Talibi axtarıb onu ölənlərin arasında tapdıq və onun bədənində doxsandan çox qılınc, ox və nizə yarası olduğunu gördük." (əl-Buxari, 4261)

## 26-cı fəsil. Peyğəmbərin ﷺ Usamə ibn Zeydi hurəqatlıların üstünə göndərməsi

## ٢٦– باب: بَعْثُ النَّبِيِّ ﷺ أُسَامَةَ بْنَ زَيْدٍ إِلَى الْحُرَقَاتِ

١٦٥٠ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ رضي الله عنهما قَالَ: بَعَثَنَا رَسُولُ اللَّهِ ﷺ إِلَى الْحُرَقَةِ، فَصَبَّحْنَا الْقَوْمَ فَهَزَمْنَاهُمْ وَلَحِقْتُ أَنَا وَرَجُلٌ مِنَ الأَنْصَارِ رَجُلاً مِنْهُمْ، فَلَمَّا غَشِينَاهُ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ. فَكَفَّ الأَنْصَارِىُّ، فَطَعَنْتُهُ بِرُمْحِى حَتَّى قَتَلْتُهُ، فَلَمَّا قَدِمْنَا بَلَغَ النَّبِىَّ ﷺ فَقَالَ: «يَا أُسَامَةُ أَقَتَلْتَهُ بَعْدَ مَا قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ» قُلْتُ كَانَ مُتَعَوِّذًا. فَمَا زَالَ يُكَرِّرُهَا حَتَّى تَمَنَّيْتُ أَنِّى لَمْ أَكُنْ أَسْلَمْتُ قَبْلَ ذَلِكَ الْيَوْمِ. [رواه البخاري: ٤٢٦٩]

**1650.** Rəvayət edilir ki, Usamə ibn Zeyd ﵄ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bizi Hurəqəyə göndərdi və biz səhər tezdən düşmənə hücum edib onları darmadağın etdik. (Döyüş əsnasında) mən ənsardan olan bir əshabə ilə birgə düşməndən olan birisinə çatıb onu yaxaladıqda o adam: "Lə ilahə illəllah"-dedi. (Bunu eşidəndə) ənsardan olan əshabə ona dəymədi, mən isə mizrağımla onu vurub öldürdüm. Biz (Mədinəyə) gəldikdə bu xəbər Peyğəmbərə ﷺ çatdı və (mənə): "Ey Usamə! (Adam) "lə ilahə illəllah" deyəndən sonra sən onu öldürmüsən?!" Dedim: "O, (məndən) qorunmaq üçün belə dedi." Peyğəmbər ﷺ bunu o qədər təkrar etdi ki, mən həmin günədək müsəlman olduğuma peşman oldum." (əl-Buxari, 4269)

١٦٥١ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ رضي الله عنه قَالَ: غَزَوْتُ مَعَ النَّبِىِّ ﷺ سَبْعَ غَزَوَاتٍ، وَخَرَجْتُ فِيمَا يَبْعَثُ مِنَ الْبُعُوثِ تِسْعَ غَزَوَاتٍ، مَرَّةً عَلَيْنَا أَبُو بَكْرٍ، وَمَرَّةً عَلَيْنَا أُسَامَةُ رضي الله عنهما. [رواه البخاري: ٤٢٧٠]

**1651.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ؓ demişdir: "Mən Peyğəmbərlə ﷺ birlikdə yeddi döyüşdə iştirak etmişəm. Habelə onun göndərdiyi, Əbu Bəkr və

---

[1] Mutə döyüşü milad tarixi ilə 629-cu ildə olmuşdur.

Usamənin növbə ilə başçılıq etdiyi belə dəstənin tərkibində doqquz yürüşdə də iştirak etmişəm." (əl-Buxari, 4270)

## ٢٧- باب: غَزْوَةُ الْفَتْحِ فِي رَمَضَانَ

## 27-ci fəsil. Ramazanda (Məkkənin) fəth edilməsi

١٦٥٢ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ خَرَجَ فِي رَمَضَانَ مِنَ الْمَدِينَةِ، وَمَعَهُ عَشَرَةُ آلاَفٍ، وَذَلِكَ عَلَى رَأْسِ ثَمَانِ سِنِينَ وَنِصْفٍ مِنْ مَقْدَمِهِ الْمَدِينَةَ، فَسَارَ هُوَ وَمَنْ مَعَهُ مِنَ الْمُسْلِمِينَ إِلَى مَكَّةَ، يَصُومُ وَيَصُومُونَ حَتَّى بَلَغَ الْكَدِيدَ – وَهُوَ مَاءٌ بَيْنَ عُسْفَانَ وَقُدَيْدٍ – أَفْطَرَ وَأَفْطَرُوا. [رواه البخاري: ٤٢٧٦]

**1652.** İbn Abbas رضي الله عنهما rəvayət etmişdir ki, Ramazan ayında Peyğəmbər ﷺ on minlik (ordu) ilə Mədinədən (Məkkəyə) yürüş etdi. Bu, onun Mədinəyə gəlişindən səkkiz il yarım sonra olmuşdur. Peyğəmbər ﷺ yanındakı müsəlmanlarla birlikdə Məkkəyə yola düşdü. Yol boyu həm özü, həm də onun əshabələri oruc tutmuşdular. Nəhayət, gəlib Kədidə – Usfan və Qudeyd arasında yerləşən bir çeşməyə – çatdıqda hamısı orucunu açdı." (əl-Buxari, 4276)

١٦٥٣ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: خَرَجَ النَّبِيُّ ﷺ فِي رَمَضَانَ إِلَى حُنَيْنٍ، وَالنَّاسُ مُخْتَلِفُونَ فَصَائِمٌ وَمُفْطِرٌ، فَلَمَّا اسْتَوَى عَلَى رَاحِلَتِهِ دَعَا بِإِنَاءٍ مِنْ لَبَنٍ أَوْ مَاءٍ، فَوَضَعَهُ عَلَى رَاحَتِهِ أَوْ عَلَى رَاحِلَتِهِ، ثُمَّ نَظَرَ إِلَى النَّاسِ فَقَالَ الْمُفْطِرُونَ لِلصُّوَّامِ أَفْطِرُوا. [رواه البخاري: ٤٢٧٧]

**1653.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Ramazan ayında Huneynə yola düşdü. Əshabələrdən kimisi oruc tutmuş, kimisi də oruc tutmamışdı. Peyğəmbər ﷺ dəvəsinə mindikdə bir qab süd və ya bir qab su gətizdirib onu ovucuna, yaxud dəvəsinin üstünə qoydu, sonra camaata nəzər saldı. Onda oruc tutmayanlar oruc tutanlara: "Orucunuzu açın!"– dedilər." (əl-Buxari, 4277)

## ٢٨- باب: أَيْنَ رَكَزَ النَّبِيُّ ﷺ الرَّايَةَ يَوْمَ الْفَتْحِ

## 28-ci fəsil. Peyğəmbər ﷺ (Məkkənin) fəthi günü bayrağı hara sancmışdı?

١٦٥٤ – عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ رضي الله عنهما قَالَ: لَمَّا سَارَ رَسُولُ اللَّهِ ﷺ عَامَ الْفَتْحِ فَبَلَغَ ذَلِكَ قُرَيْشًا، خَرَجَ أَبُو سُفْيَانَ بْنُ حَرْبٍ وَحَكِيمُ بْنُ حِزَامٍ وَبُدَيْلُ بْنُ وَرْقَاءَ يَلْتَمِسُونَ الْخَبَرَ عَنْ رَسُولِ اللَّهِ ﷺ فَأَقْبَلُوا يَسِيرُونَ حَتَّى أَتَوْا مَرَّ الظَّهْرَانِ، فَإِذَا هُمْ بِنِيرَانٍ كَأَنَّهَا نِيرَانُ عَرَفَةَ، فَقَالَ أَبُو سُفْيَانَ مَا هَذِهِ لَكَأَنَّهَا نِيرَانُ عَرَفَةَ. فَقَالَ بُدَيْلُ بْنُ وَرْقَاءَ نِيرَانُ بَنِي عَمْرٍو. فَقَالَ أَبُو سُفْيَانَ عَمْرٌو أَقَلُّ مِنْ ذَلِكَ. فَرَآهُمْ نَاسٌ مِنْ حَرَسِ رَسُولِ اللَّهِ ﷺ فَأَدْرَكُوهُمْ فَأَخَذُوهُمْ، فَأَتَوْا بِهِمْ رَسُولَ اللَّهِ ﷺ فَأَسْلَمَ أَبُو سُفْيَانَ، فَلَمَّا سَارَ قَالَ لِلْعَبَّاسِ: «احْبِسْ أَبَا سُفْيَانَ عِنْدَ حَطْمِ الْخَيْلِ حَتَّى يَنْظُرَ إِلَى الْمُسْلِمِينَ». فَحَبَسَهُ الْعَبَّاسُ، فَجَعَلَتِ الْقَبَائِلُ تَمُرُّ مَعَ النَّبِيِّ ﷺ تَمُرُّ كَتِيبَةً كَتِيبَةً عَلَى أَبِي سُفْيَانَ، فَمَرَّتْ كَتِيبَةٌ قَالَ يَا عَبَّاسُ مَنْ هَذِهِ قَالَ هَذِهِ غِفَارُ. قَالَ مَا لِي وَلِغِفَارَ ثُمَّ مَرَّتْ جُهَيْنَةُ، قَالَ مِثْلَ ذَلِكَ، ثُمَّ مَرَّتْ سَعْدُ بْنُ هُذَيْمٍ، فَقَالَ مِثْلَ ذَلِكَ، وَمَرَّتْ سُلَيْمُ، فَقَالَ مِثْلَ ذَلِكَ، حَتَّى أَقْبَلَتْ كَتِيبَةٌ لَمْ يَرَ مِثْلَهَا، قَالَ مَنْ هَذِهِ قَالَ هَؤُلاَءِ الأَنْصَارُ عَلَيْهِمْ سَعْدُ بْنُ عُبَادَةَ مَعَهُ الرَّايَةُ. فَقَالَ سَعْدُ بْنُ عُبَادَةَ يَا أَبَا سُفْيَانَ الْيَوْمُ يَوْمُ

الْمَلْحَمَة، الْيَوْمَ تُسْتَحَلُّ الْكَعْبَةُ. فَقَالَ أَبُو سُفْيَانَ يَا عَبَّاسُ حَبَّذَا يَوْمُ الذِّمَارِ. ثُمَّ جَاءَتْ كَتِيبَةٌ، وَهِيَ أَقَلُّ الْكَتَائِبِ، فِيهِمْ رَسُولُ اللَّهِ ﷺ وَأَصْحَابُهُ، وَرَايَةُ النَّبِيِّ ﷺ مَعَ الزُّبَيْرِ بْنِ الْعَوَّامِ، فَلَمَّا مَرَّ رَسُولُ اللَّهِ ﷺ بِأَبِي سُفْيَانَ قَالَ أَلَمْ تَعْلَمْ مَا قَالَ سَعْدُ بْنُ عُبَادَةَ قَالَ: «مَا قَالَ». قَالَ كَذَا وَكَذَا. فَقَالَ: «كَذَبَ سَعْدٌ، وَلَكِنْ هَذَا يَوْمٌ يُعَظِّمُ اللَّهُ فِيهِ الْكَعْبَةَ، وَيَوْمٌ تُكْسَى فِيهِ الْكَعْبَةُ». قَالَ وَأَمَرَ رَسُولُ اللَّهِ ﷺ أَنْ تُرْكَزَ رَايَتُهُ بِالْحَجُونِ. قَالَ الْعَبَّاسُ لِلزُّبَيْرِ بْنِ الْعَوَّامِ: يَا أَبَا عَبْدِ اللَّهِ، هَا هُنَا أَمَرَكَ رَسُولُ اللَّهِ ﷺ أَنْ تَرْكُزَ الرَّايَةَ، قَالَ وَأَمَرَ رَسُولُ اللَّهِ ﷺ يَوْمَئِذٍ خَالِدَ بْنَ الْوَلِيدِ أَنْ يَدْخُلَ مِنْ أَعْلَى مَكَّةَ مِنْ كَدَاءٍ، وَدَخَلَ النَّبِيُّ ﷺ مِنْ كُدًا، فَقُتِلَ مِنْ خَيْلِ خَالِدٍ يَوْمَئِذٍ رَجُلاَنِ حُبَيْشُ بْنُ الأَشْعَرِ وَكُرْزُ بْنُ جَابِرٍ الْفِهْرِيُّ. [رواه البخاري: ٤٢٨٠]

**1654.** Rəvayət edilir ki, Urva ibn Zubeyr ﷺ demişdir: “Peyğəmbər ﷺ (Məkkənin) fəthi ilində (Mədinədən) yola düşdü. Bu xəbər qureyşlilərə yetişdiyi zaman Əbu Süfyan ibn Hərb, Həkim ibn Hizam və Budeyl ibn Vərqa yola çıxıb Peyğəmbərin ﷺ barəsində məlumat toplamağa başladılar. Onlar bir müddət yol getdilər və nəhayət, gəlib Mərruz-Zəhran vadisinə[1] çatdılar. Bir də gördülər ki, Ərafatda olan ocaqlar[2] qədər ocaqlar görünür. Əbu Süfyan dedi: “Bu nədir? Bu, lap Ərəfatdakı ocaqlara bənzəyir.” Budeyl ibn Vərqa dedi: “(Deyəsən bu,) Bəni Amr qəbiləsinin ocaqlarıdır.” Əbu Süfyan dedi: “Amr (oğullarının) sayı bundan azdır.” Bu vaxt Peyğəmbərin ﷺ gözətçilərindən bəziləri onları görüb arxalarınca gəldilər və onları tutub Peyğəmbərin ﷺ hüzuruna gətirdilər. Orada Əbu Süfyan İslamı qəbul etdi. O, çıxıb getdikdə Peyğəmbər ﷺ Abbasa dedi: “Dağ keçidinə çatdıqda Əbu Süfyanı ləngit ki, müsəlmanları görə bilsin.” (Həmin yerə çatdıqda) Abbas onu ləngitdi. Elə bu vaxt qəbilələr dəstə-dəstə onun qabağından keçib getməyə başladı. Peyğəmbər ﷺ də onların arasında idi. Birinci dəstə keçərkən Əbu Süfyan dedi: “Ey Abbas, bunlar kimlərdir?” Abbas dedi: “Bu, Ğifar (qəbiləsidir).” Əbu Süfyan dedi: “Mən hara, Ğifar qəbiləsi hara!” Sonra Cuheynə qəbiləsi keçdi və Əbu Süfyan (əvvəlkinə) bənzər sözlər söylədi. Sonra Səd ibn Huzeyn qəbiləsi keçdi və o (yenə) buna bənzər sözlər söylədi. Sonra Suleym qəbiləsi keçdi və o (yenə) buna bənzər sözlər söylədi. Nəhayət, heç vaxt bənzərini görmədiyi bir qəbilə keçdi. Əbu Süfyan: “Bunlar kimlərdir?”- deyə soruşdu. Abbas dedi: “Bunlar ənsardır. Başlarında duran bayraqdar isə Səd ibn Ubadədir.” Bu vaxt Səd ibn Ubadə dedi: “Ey Əbu Süfyan, bu gün əzəmətli bir savaş günüdür, bu gün Kəbə (yanında döyüşmək belə) halal olacaq.” Əbu Süfyan dedi: “Ey Abbas, (deyəsən, bu gün) həlak olacağımız bir gündür!” Bunun ardınca dəstələr arasında ən azsaylı dəstə gəlib keçdi. Peyğəmbər ﷺ və onun əshabələri bu dəstədə idilər. Peyğəmbərin ﷺ bayrağını Zubeyr ibn Əvvam daşıyırdı. Peyğəmbər ﷺ Əbu Süfyanın qarşısından keçərkən Əbu Süfyan (ona) dedi: “Bilirsənmi Səd ibn Ubadə nə dedi?” Peyğəmbər ﷺ soruşdu: “Nə deyib ki?” Əbu Süfyan dedi: “Belə-belə!” Peyğəmbər ﷺ buyurdu: “Səd səhv deyir, əksinə, bu, Allahın Kəbənin şanını göylərə qaldırdığı bir gündür. Habelə, Kəbənin üstünə örtük salınacağı bir gündür.” Sonra Peyğəmbər ﷺ bayrağının Həcuna sancılmasını əmr etdi.”

(Urva demişdir): “Abbas Zubeyr ibn Əvvama dedi: “Ey Əbu Abdullah! Peyğəmbər ﷺ sənə bayrağını bax buraya sancmağı əmr etdi.”

---

[1] 309-cu hədisin qeydlərinə bax.

[2] Belə ki, həcc ziyarəti əsnasında hacılar Ərəfatda çox sayda ocaqlar yandırardılar.

(Urva demişdir): “Həmin gün Peyğəmbər ﷺ Xalid ibn Vəlidə Məkkəyə şəhərin yuxarı tərəfindən, Kəda istiqamətindən daxil olmağı əmr etdi. Peyğəmbər ﷺ özü isə (Məkkəyə) Kudadan daxil oldu. Həmin gün Xalid ibn Vəlidin dəstəsindəki atlılardan ikisi – Hubeyş ibn əl-Əşər və Kurz ibn Cabir əl-Fəhri öldürüldü.” (əl-Buxari, 4280)

١٦٥٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مُغَفَّلٍ رضي الله عنه قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ يَوْمَ فَتْحِ مَكَّةَ عَلَى نَاقَتِهِ، وَهُوَ يَقْرَأُ سُورَةَ الْفَتْحِ يُرَجِّعُ، وَقَالَ لَوْلاَ أَنْ يَجْتَمِعَ النَّاسُ حَوْلِى لَرَجَّعْتُ كَمَا رَجَّعَ. [رواه البخاري: ٤٢٨١]

**1655.** Rəvayət edilir ki, Abdullah ibn Müğəffəl رضي الله عنه demişdir: “Məkkənin fəthi günü mən Peyğəmbərin ﷺ dəvəsinin üstündə oturub zəngulə[1] vuraraq “əl-Fəth” surəsini oxuduğunu gördüm.

Əgər camaat başıma yığılmasaydı mən də Quranı onun kimi zəngulə vuraraq oxuyardım”. (əl-Buxari, 4281)

١٦٥٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ رضي الله عنه قَالَ: دَخَلَ النَّبِىُّ ﷺ مَكَّةَ يَوْمَ الْفَتْحِ وَحَوْلَ الْبَيْتِ سِتُّونَ وَثَلاَثُمِائَةِ نُصُبٍ، فَجَعَلَ يَطْعُنُهَا بِعُودٍ فِى يَدِهِ وَيَقُولُ: ﴿جَآءَ ٱلْحَقُّ وَزَهَقَ ٱلْبَٰطِلُ﴾ ﴿قُلْ جَآءَ ٱلْحَقُّ وَمَا يُبْدِئُ ٱلْبَٰطِلُ وَمَا يُعِيدُ﴾. [رواه البخاري: ٤٢٨٧]

**1656.** Rəvayət edilir ki, Abdullah ibn Məsud رضي الله عنه demişdir: “Məkkənin fəthi günü Peyğəmbər ﷺ Məkkəyə daxil olduqda Kəbənin ətrafında üç yüz altmış büt var idi. Peyğəmbər ﷺ əlindəki ağacla onları vurub yıxmağa başladı və bu ayələri oxudu: **“Haqq gəldi, batil puç olub getdi”[2]. “Haqq gəldi. Batil** ***ona qarşı*** **nə ortaya** ***bir şey*** **çıxarar, nə də** ***onu*** **qaytara bilər”[3].** (əl-Buxari, 4287)

## 29-cu fəsil

## ٢٩– باب

١٦٥٧ – عَنْ عَمْرِو بْنِ سَلَمَةَ رضي الله عنه قَالَ: كُنَّا بِمَاءٍ مَمَرَّ النَّاسِ، وَكَانَ يَمُرُّ بِنَا الرُّكْبَانُ فَنَسْأَلُهُمْ مَا لِلنَّاسِ مَا لِلنَّاسِ مَا هَذَا الرَّجُلُ فَيَقُولُونَ يَزْعُمُ أَنَّ اللَّهَ أَرْسَلَهُ أَوْحَى إِلَيْهِ، أَوْ أَوْحَى اللَّهُ بِكَذَا. فَكُنْتُ أَحْفَظُ ذَلِكَ الْكَلاَمَ، وَكَأَنَّمَا يُغْرَى فِى صَدْرِى، وَكَانَتِ الْعَرَبُ تَلَوَّمُ بِإِسْلاَمِهِمِ الْفَتْحَ، فَيَقُولُونَ اتْرُكُوهُ وَقَوْمَهُ، فَإِنَّهُ إِنْ ظَهَرَ عَلَيْهِمْ فَهْوَ نَبِىٌّ صَادِقٌ. فَلَمَّا كَانَتْ وَقْعَةُ أَهْلِ الْفَتْحِ بَادَرَ كُلُّ قَوْمٍ بِإِسْلاَمِهِمْ، وَبَدَرَ أَبِى قَوْمِى بِإِسْلاَمِهِمْ، فَلَمَّا قَدِمَ قَالَ جِئْتُكُمْ وَاللَّهِ مِنْ عِنْدِ النَّبِىِّ ﷺ حَقًّا فَقَالَ: «صَلُّوا صَلاَةَ كَذَا فِى حِينِ كَذَا، وَصَلُّوا كَذَا فِى حِينِ كَذَا، فَإِذَا حَضَرَتِ الصَّلاَةُ، فَلْيُؤَذِّنْ أَحَدُكُمْ، وَلْيَؤُمَّكُمْ أَكْثَرُكُمْ قُرْآنًا». فَنَظَرُوا فَلَمْ يَكُنْ أَحَدٌ أَكْثَرَ قُرْآنًا مِنِّى، لِمَا كُنْتُ أَتَلَقَّى مِنَ الرُّكْبَانِ، فَقَدَّمُونِى بَيْنَ أَيْدِيهِمْ، وَأَنَا ابْنُ سِتٍّ أَوْ سَبْعِ، سِنِينَ وَكَانَتْ عَلَىَّ بُرْدَةٌ، كُنْتُ إِذَا

---

[1] Zəngulə: iki qonşu tonun tez təkrarından əmələ gələn titrək səs. Digər hədisdə Müaviyə ibn Qurra bu hədisi rəvayət etdikdə Şöbə ondan soruşmuşdur ki: “Abdullah ibn Müğəffəl رضي الله عنه zənguləni necə vurardı?” Müaviyə də bunu səsləndirib demişdir: “ə-ə-ə” üç kərə.” Səhih əl-Buxari, 7540.

Alimlər Peyğəmbərin ﷺ Quran oxuyarkən əsla zəngulə vurmadığını, bu hədisdə isə, dəvənin üstündə olduğundan avazla oxuduğu ayələrin bu cür səsləndiyini demişlər.

[2] “əl-İsra” surəsi, 81.

[3] “Səba” surəsi, 49.

سَجَدْتُ تَقَلَّصَتْ عَنِّى، فَقَالَتِ امْرَأَةٌ مِنَ الْحَىِّ أَلاَ تُغَطُّوا عَنَّا اسْتَ قَارِئِكُمْ. فَاشْتَرَوْا فَقَطَعُوا لِى قَمِيصًا، فَمَا فَرِحْتُ بِشَىْءٍ فَرَحِى بِذَلِكَ الْقَمِيصِ. [رواه البخاري: ٤٣٠٢]

**1657.** Rəvayət edilir ki, Amr ibn Sələmə ﷺ demişdir: "Biz yol kənarındakı suyun başında ikən yanımızdan karvanlar keçirdi və biz onlardan soruşurduq: "Nə olub insanlara? Nə olub insanlara? Kimdir bu adam?" Onlar deyirdilər: "Bu adam iddia edir ki, Allah onu peyğəmbər göndərmiş və ona vəhy (nazil) etmişdir və ya filan şeyi ona vəhy etmişdir." (O vaxt) mən bu kəlmələri[1] yadımda saxlayırdım. (Onlar) sanki mənim qəlbimə hopdurulurdu. (Bir çox) ərəblərə gəlincə, onlar İslamı qəbul etməyi Məkkənin fəthinədək gecikdirir və deyirdilər: "Onu həmqəbilələri ilə yalnız buraxın. Əgər onlara qalib gələrsə, demək, o, əsil peyğəmbər imiş." Məkkə fəth olunduqdan sonra isə bütün qəbilələr İslamı qəbul etməyə tələsdilər. Atam mənim həmqəbilərimdən qabaq İslamı qəbul etmiş və (Peyğəmbərin ﷺ yanından ) qayıtdıqda demişdi: "Vallahi, mən əsl Peyğəmbərin ﷺ yanından gəlirəm. O buyurur ki: "Filan namazı filan vaxt qılın, filan namazı da filan vaxt qılın! Namaz vaxtı yetişdikdə, qoy biriniz azan versin və Qurandan ən çox (ayə) biləniniz də sizə namaz qıldırsın." (Həmqəbilələrim belə bir adam) axtardılar, lakin Quranı məndən çox bilən bir kimsə tapa bilmədilər. Mən (Quran ayələrini) karvanla gəlib-gedən adamlardan öyrənmişdim. Elə bu səbəbdən də həmqəbilələrim məni özlərinə imam təyin etdilər. Həmin vaxt mənim altı, yaxud yeddi yaşım vardı. Əynimdə də olduqca gödək bir bürüncək var idi. Mən səcdəyə getdikdə bürüncəyin ətəyi yuxarı qalxırdı (və üstüm açılırdı). O zaman qəbiləmizdən olan bir qadın dedi: "Bəlkə imamınızın ayıb yerlərini örtəsiniz, biz onu görməyək!" (Bu sözdən) sonra həmqəbilələrim parça alıb mənim üçün (uzun) bir köynək tikdilər. Mən (o vaxt) belə bir köynəyim olduğuna sevindiyim qədər heç bir şeyə sevinməmişdim." (əl-Buxari, 4302)

## 30-cu fəsil. Uca Allahın: "...Huneyn günündə sizə kömək etmişdi. O zaman çoxluğunuza aludə oldunuz..." ayəsindən "Allah Bağışlayandır, Rəhmlidir" ayəsinə qədər[2]

## ٣٠– باب: قَوْلُ اللهِ: ﴿وَيَوْمَ حُنَيْنٍ إِذْ أَعْجَبَتْكُمْ كَثْرَتُكُمْ﴾ إِلَى قَوْلِهِ: ﴿غَفُورٌ رَّحِيمٌ﴾

١٦٥٨ – عَنْ إِسْمَاعِيلَ قَالَ: رَأَيْتُ بِيَدِ ابْنِ أَبِى أَوْفَى ضَرْبَةً، قَالَ: ضُرِبْتُهَا مَعَ النَّبِىِّ ﷺ يَوْمَ حُنَيْنٍ. [رواه البخاري: ٤٣١٤]

---

[1] Yəni camaatın nəql etdiyi ayələri.

[2] Uca Allah buyurur: **"Həqiqətən, Allah əksər döyüşlərdə, habelə Huneyn günündə də sizə kömək etmişdi. O zaman çoxluğunuza aludə oldunuz, amma *bu* sizin karınıza gəlmədi. Yer üzü, genişliyinə baxmayaraq, sizə dar gəldi, sonra geriyə çevrilib qaçdınız. Sonra Allah Öz Elçisinə və möminlərə əminlik nazil etdi, görə bilmədiyiniz döyüşçülər göndərdi və kafirlərə əzab verdi. Budur kafirlərin cəzası. Bundan sonra isə Allah istədiyinin tövbəsini qəbul edər. Çünki Allah Bağışlayandır, Rəhmlidir."** "ət-Tovbə" surəsi, 25-27.

**1658.** Rəvayət edilir ki, İsmail demişdir: "Mən Abdullah ibn Əbu Əufənin ﷺ əlində bir çapıq gördüm. Dedi ki: "Bu, Huneyn günü Peyğəmbərin ﷺ yanında olarkən aldığım zərbənin izidir." (əl-Buxari, 4314)

## 31-ci fəsil. Əvtas[1] döyüşü

## ٣١- باب: غَزَاةُ أَوْطَاسٍ

١٦٥٩ - عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: لَمَّا فَرَغَ النَّبِيُّ ﷺ مِنْ حُنَيْنٍ بَعَثَ أَبَا عَامِرٍ عَلَى جَيْشٍ إِلَى أَوْطَاسٍ فَلَقِيَ دُرَيْدَ بْنَ الصِّمَّةِ، فَقُتِلَ دُرَيْدٌ وَهَزَمَ اللَّهُ أَصْحَابَهُ. قَالَ أَبُو مُوسَى وَبَعَثَنِي مَعَ أَبِي عَامِرٍ فَرُمِيَ أَبُو عَامِرٍ فِي رُكْبَتِهِ، رَمَاهُ جُشَمِيٌّ بِسَهْمٍ فَأَثْبَتَهُ فِي رُكْبَتِهِ، فَانْتَهَيْتُ إِلَيْهِ فَقُلْتُ يَا عَمِّ مَنْ رَمَاكَ فَأَشَارَ إِلَى أَبِي مُوسَى فَقَالَ ذَاكَ قَاتِلِي الَّذِي رَمَانِي. فَقَصَدْتُ لَهُ فَلَحِقْتُهُ فَلَمَّا رَآنِي وَلَّى فَاتَّبَعْتُهُ وَجَعَلْتُ أَقُولُ لَهُ أَلاَ تَسْتَحِي، أَلاَ تَثْبُتُ. فَكَفَّ فَاخْتَلَفْنَا ضَرْبَتَيْنِ بِالسَّيْفِ فَقَتَلْتُهُ ثُمَّ قُلْتُ لأَبِي عَامِرٍ قَتَلَ اللَّهُ صَاحِبَكَ. قَالَ فَانْزِعْ هَذَا السَّهْمَ فَنَزَعْتُهُ فَنَزَا مِنْهُ الْمَاءُ. قَالَ يَا ابْنَ أَخِي أَقْرِئِ النَّبِيَّ ﷺ السَّلاَمَ، وَقُلْ لَهُ اسْتَغْفِرْ لِي. وَاسْتَخْلَفَنِي أَبُو عَامِرٍ عَلَى النَّاسِ، فَمَكَثَ يَسِيرًا ثُمَّ مَاتَ، فَرَجَعْتُ فَدَخَلْتُ عَلَى النَّبِيِّ ﷺ فِي بَيْتِهِ عَلَى سَرِيرٍ مُرْمَلٍ وَعَلَيْهِ فِرَاشٌ قَدْ أَثَّرَ رِمَالُ السَّرِيرِ بِظَهْرِهِ وَجَنْبَيْهِ، فَأَخْبَرْتُهُ بِخَبَرِنَا وَخَبَرِ أَبِي عَامِرٍ، وَقَالَ قُلْ لَهُ اسْتَغْفِرْ لِي، فَدَعَا بِمَاءٍ فَتَوَضَّأَ ثُمَّ رَفَعَ يَدَيْهِ فَقَالَ: «اللَّهُمَّ اغْفِرْ لِعُبَيْدٍ أَبِي عَامِرٍ». وَرَأَيْتُ بَيَاضَ إِبْطَيْهِ ثُمَّ قَالَ: «اللَّهُمَّ اجْعَلْهُ يَوْمَ الْقِيَامَةِ فَوْقَ كَثِيرٍ مِنْ خَلْقِكَ مِنَ النَّاسِ». فَقُلْتُ وَلِي فَاسْتَغْفِرْ. فَقَالَ: «اللَّهُمَّ اغْفِرْ لِعَبْدِ اللَّهِ بْنِ قَيْسٍ ذَنْبَهُ وَأَدْخِلْهُ يَوْمَ الْقِيَامَةِ مُدْخَلاً كَرِيمًا». [رواه البخاري: ٤٣٢٣]

**1659.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "Peyğəmbər ﷺ Huneyn döyüşünü başa çatdırdıqdan sonra Əbu Amirin başçılığı altında Əvtasa qoşun göndərdi. Əbu Amir orada Dureyd ibn Simmə ilə qarşı-qarşıya gəldi. (Bu döyüşdə) Dureyd öldürüldü və Allah onun tərəfdarlarını məğlub etdi." Peyğəmbər ﷺ məni də Əbu Amirlə birgə göndərmişdi. (Döyüşdə) Cuşəmi (deyilən birisi) oxla Əbu Amiri dizindən yaraladı və ox onun dizində ilişib qaldı. Mən onun yanına gəlib dedim: "Əmi, kim vurdu səni?" O mənə həmin adamı göstərib dedi: "Budur məni vuran qatil." Mən onun üstünə cumub ona çatdım. O məni görəndə dönüb qaçmağa başladı. Mən də onun dalınca qaçdım və ona dedim: "Utanmırsanmı? (Cürətin çatmır) dayanasan?" (Bunu eşidəndə) o dayandı, biz qılıncla biri-birimizə zərbə endirdik və mən onu öldürdüm. Sonra (gəlib) Əbu Amirə dedim: "Allah sənin düşmənini öldürdü." O dedi: "Bu oxu dart çıxsın." Mən oxu dartıb çıxartdıqda yaradan qanlı çirk axdı. O dedi: "Qardaş oğlu, mənim salamımı Peyğəmbərə ﷺ çatdırarsan və deyərsən ki, mənim üçün bağışlanma diləsin." Sonra Əbu Amir məni camaata başçı təyin etdi və az müddət keçdikdən sonra vəfat etdi. Mən geri qayıtdıqda gəlib Peyğəmbərin ﷺ evinə daxil oldum. Peyğəmbər ﷺ üstü xurma liflərindən toxunmuş və üstünə nazik örtük sərilmiş bir çarpayıda uzanmışdı. İplər onun kürəyində və böyründə iz buraxmışdı. Mən həm bizim, həm də Əbu Amirin başına gələnləri ona danışdım. (Dedim: "Ya Rəsulullah, Əbu Amir) dedi: "Peyğəmbərə ﷺ deyərsən, mənim üçün bağışlanma diləsin." Onda

[1] Həvazin qəbiləsində yerləşən bir vadi.

Peyğəmbər ﷺ su gətizdirib dəstəmaz aldı, sonra əllərini (göyə) qaldırıb dedi: "Allahım, qulun Əbu Amiri bağışla!" (Peyğəmbər ﷺ əllərini elə qaldırdı ki, hətta) mən onun qoltuğunun ağlığını gördüm. O davam edib dedi: "Allahım, Qiyamət günü onu yaratdığın insanların bir çoxundan üstün et!" Mən dedim: "(Ya Rəsulullah,) mənim üçün də bağışlanma dilə." Peyğəmbər ﷺ (dua edib) dedi: "Allahım, Abdullah ibn Qeysin günahlarını bağışla və Qiyamət günü onu olduqca şərəfli bir məqama çatdır!" (əl-Buxari, 4323)

## 32-ci fəsil. (Hicrətin) səkkizinci ilində şəvval ayında olmuş Taif döyüşü

## ٣٢- باب: غَزْوَةُ الطَّائِفِ فِي شَوَّالٍ سَنَةَ ثَمَانٍ

١٦٦٠ – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها قَالَتْ: دَخَلَ عَلَيَّ النَّبِيُّ ﷺ وَعِنْدِي مُخَنَّثٌ فَسَمِعْتُهُ يَقُولُ لِعَبْدِ اللَّهِ بْنِ أَبِي أُمَيَّةَ يَا عَبْدَ اللَّهِ أَرَأَيْتَ إِنْ فَتَحَ اللَّهُ عَلَيْكُمُ الطَّائِفَ غَدًا فَعَلَيْكَ بِابْنَةِ غَيْلَانَ، فَإِنَّهَا تُقْبِلُ بِأَرْبَعٍ وَتُدْبِرُ بِثَمَانٍ. وَقَالَ النَّبِيُّ ﷺ: «لاَ يَدْخُلَنَّ هَؤُلاَءِ عَلَيْكُنَّ». [رواه البخاري: ٤٣٢٤]

**1660.** Rəvayət edilir ki, Ummu Sələmə رضي الله عنها demişdir: "(Bir dəfə Hit adlı) bir xonsa[1] mənim yanımda ikən Peyğəmbər ﷺ içəri girdi və (bu xonsanın) Abdullah ibn Əbu Umeyyəyə[2] belə dediyini eşitdi: "Ey Abdullah, əgər sabah Allah sizə Taifi fəth etməyi nəsib edərsə, sən Ğeylanın qızını ələ keçirməyə çalış. Çünki o, (qız o qədər toppuşdur ki,) ön tərəfindən (onun bədəninin) dörd qatı, arxa tərəfindən isə səkkiz qatı görünür." (Bunu eşidəndə) Peyğəmbər ﷺ (Ummu Sələməyə) buyurdu: "Belələri sizin yanınıza gəlməməlidirlər." (əl-Buxari, 4324)

١٦٦١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: لَمَّا حَاصَرَ رَسُولُ اللَّهِ ﷺ الطَّائِفَ فَلَمْ يَنَلْ مِنْهُمْ شَيْئًا قَالَ «إِنَّا قَافِلُونَ إِنْ شَاءَ اللَّهُ». فَثَقُلَ عَلَيْهِمْ وَقَالُوا نَذْهَبُ وَلاَ نَفْتَحُهُ – وَقَالَ مَرَّةً نَقْفُلُ – فَقَالَ: «اغْدُوا عَلَى الْقِتَالِ». فَغَدَوْا فَأَصَابَهُمْ جِرَاحٌ فَقَالَ: «إِنَّا قَافِلُونَ غَدًا إِنْ شَاءَ اللَّهُ». فَأَعْجَبَهُمْ فَضَحِكَ النَّبِيُّ ﷺ. [رواه البخاري: ٤٣٢٥]

**1661.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Taifi mühasirəyə aldıqdan sonra heç bir şeyə nail olmadıqda dedi: "Əgər Allah istəsə, biz (Mədinəyə) qayıdacağıq." Bu (söz) əshabələrə ağır gəldi və onlar dedilər: "Doğrudanmı biz bu (şəhəri) fəth etmədən çıxıb gedəcəyik?" Onda Peyğəmbər ﷺ buyurdu: "Elə isə gedin vuruşun!" Onlar döyüşə atıldılar, (lakin onların çoxu döyüşdə) yaralandı. Belə olduqda Peyğəmbər ﷺ: "Əgər Allah istəsə, biz geri qayıdacağıq"- dedi və bu (söz) əshabələrin xoşuna gəldi. Onda Peyğəmbər ﷺ gülümsədi." (əl-Buxari, 4325)

١٦٦٢ – عَنْ سَعْدٍ رضي الله عنه وَأَبِي بَكْرَةَ رضي الله عنهما فَقَالاَ: سَمِعْنَا النَّبِيَّ ﷺ يَقُولُ: «مَنِ ادَّعَى إِلَى غَيْرِ أَبِيهِ وَهُوَ يَعْلَمُ فَالْجَنَّةُ عَلَيْهِ حَرَامٌ». [رواه البخاري: ٤٣٢٦]

---

[1] Burada "xonsa" deyildikdə, ya özündə hər iki cinsin əlamətləri olan və qadına meyl salmayan arvadsifət kişi, ya da fasiqlər tərəfindən axtalanmış kişi nəzərdə tutulur. "Avnul-Məbud", 9/143

[2] Abdullah ibn Əbu Umeyyə رضي الله عنه Ummu Sələmənin رضي الله عنها qardaşıdır.

**1662.** Rəvayət edilir ki, Səd və Əbu Bəkrə ﵄ demişdir: "Biz Peyğəmbərin ﷺ belə dediyini eşitmişik: "Hər kəs atasının kim olduğunu bilə-bilə başqa bir kişinin oğlu olduğunu iddia etsə, Cənnət ona haram olar." (əl-Buxari, 4326)

**١٦٦٣** – وَ فِي رِوَايَة: «أَمَّا أَحَدُهُمَا فَأَوَّلُ مَنْ رَمَى بِسَهْمٍ فِي سَبِيلِ اللَّه، وَأَمَّا الآخَرُ فَكَانَ تَسَوَّرَ حِصْنَ الطَّائِف فِي أُنَاسٍ فَجَاءَ إِلَى النَّبِيِّ ﷺ فَنَزَلَ إِلَى النَّبِيِّ ﷺ ثَالِث ثَلاَثَةٍ وَعِشْرِينَ مِنَ الطَّائِفِ». [رواه البخاري: ٤٣٢٧]

**1663.** Digər rəvayətdə deyilmişdir: "Bunlardan biri[1] Allah yolunda ilk ox atan kimsədir, digəri[2] isə Taif mühasirəyə alındığı zaman (şəhər divarını aşıb) Peyğəmbərin ﷺ yanına gəlmiş iyirmi üç kişinin iyirmi üçüncüsüdür." (əl-Buxari, 4327)

**١٦٦٤** – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: كُنْتُ عِنْدَ النَّبِيِّ ﷺ وَهُوَ نَازِلٌ بِالْجِعْرَانَة بَيْنَ مَكَّةَ وَالْمَدِينَة وَمَعَهُ بِلاَلٌ، فَأَتَى النَّبِيَّ ﷺ أَعْرَابِيٌّ فَقَالَ أَلاَ تُنْجِزُ لِي مَا وَعَدْتَنِي. فَقَالَ لَهُ: «أَبْشِرْ». فَقَالَ قَدْ أَكْثَرْتَ عَلَيَّ مِنْ أَبْشِرْ. فَأَقْبَلَ عَلَى أَبِي مُوسَى وَبِلاَلٍ كَهَيْئَةِ الْغَضْبَانِ فَقَالَ: «رَدَّ الْبُشْرَى فَاقْبَلاَ أَنْتُمَا». قَالاَ قَبِلْنَا. ثُمَّ دَعَا بِقَدَحٍ فِيه مَاءٌ فَغَسَلَ يَدَيْه وَوَجْهَهُ فِيه، وَمَجَّ فِيه، ثُمَّ قَالَ: «اشْرَبَا مِنْهُ، وَأَفْرِغَا عَلَى وُجُوهِكُمَا وَنُحُورِكُمَا، وَأَبْشِرَا». فَأَخَذَا الْقَدَحَ فَفَعَلاَ، فَنَادَتْ أُمُّ سَلَمَةَ مِنْ وَرَاءِ السِّتْرِ أَنْ أَفْضِلاَ لأُمِّكُمَا. فَأَفْضَلاَ لَهَا مِنْهُ طَائِفَةً. [رواه البخاري: ٤٣٢٨]

**1664.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "Peyğəmbər ﷺ Bilal ilə birlikdə Məkkə ilə Mədinə arasında yerləşən Ciranədə düşərgə saldığı zaman mən onların yanında idim. Bu vaxt bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Mənə verdiyin vədi yerinə yetirəcəksənmi?" Peyğəmbər ﷺ (ona): "Sevin!"- deyə buyurdu. Bədəvi dedi: "Bu sözü sən mənə çox demisən."

Peyğəmbər ﷺ qəzəbli halda üzünü Əbu Musaya ﷺ və Bilala ﷺ tərəf çevirib dedi: "(Bu adam) müjdəni rədd etdi, elə isə siz onu qəbul edin!" Hər ikisi: "Qəbul etdik!"– dedilər. Bundan sonra Peyğəmbər ﷺ bir cam su gətizdirib əllərini və üzünü yudu, ağzını yaxaladı, sonra da buyurdu: "İçin bu sudan, (yerdə qalanını da) üzünüzə və boynunuza tökün, (üstəlik xoş bir xəbərə) sevinin!" (Bunu deyəndə) hər ikisi camı götürüb (onun dediklərini) yerinə yetirdi. Bu vaxt Ummu Sələmə pərdə arxasından onları səsləyib: "Ananız üçün də bir şey saxlayın!"– dedi və onlar bu sudan bir qədər ona da saxladılar. (əl-Buxari, 4328)

**١٦٦٥** – عَنْ أَنَسِ بْنِ مَالِك ﷺ قَالَ: جَمَعَ النَّبِيُّ ﷺ نَاسًا مِنَ الأَنْصَار، فَقَالَ «إِنَّ قُرَيْشًا حَدِيثُ عَهْد بِجَاهِلِيَّة وَمُصِيبَة، وَإِنِّي أَرَدْتُ أَنْ أَجْبُرَهُمْ وَأَتَأَلَّفَهُمْ أَمَا تَرْضَوْنَ أَنْ يَرْجِعَ النَّاسُ بِالدُّنْيَا، وَتَرْجِعُونَ بِرَسُول اللَّه ﷺ إِلَى بُيُوتِكُمْ». قَالُوا بَلَى. قَالَ: «لَوْ سَلَكَ النَّاسُ وَادِيًا وَسَلَكَتِ الأَنْصَارُ شِعْبًا لَسَلَكْتُ وَادِيَ الأَنْصَارِ أَوْ شِعْبَ الأَنْصَارِ». [رواه البخاري: ٤٣٣٤]

**1665.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ ənsardan bəzi adamları bir yerə yığıb dedi: "Qureyşlilər İslamı yenicə qəbul etmiş və (çox) müsibətlər görmüşlər. Mən sadəcə onların könlünü almaq və qəlblərini (İslama) isinişdirmək istədim. Əcəba, insanlar dünya malı ilə geri

[1] Burada Səd ibn Əbu Vəqqas ﷺ nəzərdə tutulur.
[2] Burada Əbu Bəkrə ﷺ qəsd edilir.

döndüyü halda, siz evinizə Allahın Rəsulu ilə qayıtmağa razı deyilsinizmi? Onlar: “Razıyıq!”– dedilər. Onda Peyğəmbər ﷺ buyurdu: “Əgər insanlar bir vadiyə üz tutsaydı, ənsar isə (başqa bir vadiyə, yaxud) bir dərəyə üz tutsaydı, mən ənsarın getdiyi vadiyə, yaxud dərəyə üz tutardım!” (əl-Buxari, 4334)

## 33-cü fəsil. Peyğəmbərin Xalid ibn Vəlidi Bəni Cəzimə qəbiləsinin üstünə göndərməsi

## ٣٣- باب: بَعْثُ النَّبِىِّ ﷺ خَالِدَ بْنَ الْوَلِيدِ إِلَى بَنِى جَذِيمَةَ

١٦٦٦ – عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: بَعَثَ النَّبِىُّ ﷺ خَالِدَ بْنَ الْوَلِيدِ إِلَى بَنِى جَذِيمَةَ، فَدَعَاهُمْ إِلَى الإِسْلاَمِ فَلَمْ يُحْسِنُوا أَنْ يَقُولُوا أَسْلَمْنَا. فَجَعَلُوا يَقُولُونَ صَبَأْنَا، صَبَأْنَا. فَجَعَلَ خَالِدٌ يَقْتُلُ مِنْهُمْ وَيَأْسِرُ، وَدَفَعَ إِلَى كُلِّ رَجُلٍ مِنَّا أَسِيرَهُ، حَتَّى إِذَا كَانَ يَوْمٌ أَمَرَ خَالِدٌ أَنْ يَقْتُلَ كُلُّ رَجُلٍ مِنَّا أَسِيرَهُ فَقُلْتُ وَاللَّهِ لاَ أَقْتُلُ أَسِيرِى، وَلاَ يَقْتُلُ رَجُلٌ مِنْ أَصْحَابِى أَسِيرَهُ، حَتَّى قَدِمْنَا عَلَى النَّبِىِّ ﷺ فَذَكَرْنَاهُ، فَرَفَعَ النَّبِىُّ ﷺ يَدَهُ فَقَالَ: «اللَّهُمَّ إِنِّى أَبْرَأُ إِلَيْكَ مِمَّا صَنَعَ خَالِدٌ». مَرَّتَيْنِ. [رواه البخاري: ٤٣٣٩]

**1666.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: “Peyğəmbər ﷺ Xalid ibn Vəlidi Bəni Cəzimə qəbiləsinin üstünə göndərib onları İslama dəvət etdi. Onlar: “Müsəlman olduq!”– demədilər, (əvəzində): “Döndük[1], döndük!”– dedilər. Onda Xalid رضي الله عنه onların (bir çoxunu) öldürdü (yerdə qalanını da) əsir götürdü və bizim hər birimizə bir əsir bağışladı. Nəhayət, günlərin bir günü Xalid bizim hər birimizə (əlinin altında olan) əsirini öldürməyi əmr etdi. Dedim: “Vallahi ki, nə mən, nə də dostlarımdan bir kimsə öz əsirini öldürməyəcəkdir.” Nəhayət, biz Peyğəmbərin ﷺ yanına gəlib bu hadisəni ona danışdıqda Peyğəmbər ﷺ əllərini (göyə) qaldırıb iki dəfə dedi: “Allahım, həqiqətən də, mən Xalidin etdiyi əməldən uzağam!” (əl-Buxari, 4339)

## 34-cü fəsil. Abdulla ibn Huzafə əs-Səhminin və Əlqəmə ibn Mucəzziz əl-Mudlicinin dəstəsi, buna ənsar dəstəsi də deyilir

## ٣٤- باب: سَرِيَّةُ عَبْدِ اللَّهِ بْنِ حُذَافَةَ السَّهْمِىِّ وَعَلْقَمَةَ بْنِ مُجَزِّزٍ الْمُدْلِجِىِّ. وَيُقَالُ إِنَّهَا سَرِيَّةُ الأَنْصَارِ

١٦٦٧ – عَنْ عَلِىٍّ رضي الله عنه قَالَ: بَعَثَ النَّبِىُّ ﷺ سَرِيَّةً فَاسْتَعْمَلَ رَجُلاً مِنَ الأَنْصَارِ، وَأَمَرَهُمْ أَنْ يُطِيعُوهُ، فَغَضِبَ فَقَالَ أَلَيْسَ أَمَرَكُمُ النَّبِىُّ ﷺ أَنْ تُطِيعُونِى. قَالُوا بَلَى. قَالَ فَاجْمَعُوا لِى حَطَبًا. فَجَمَعُوا، فَقَالَ أَوْقِدُوا نَارًا. فَأَوْقَدُوهَا، فَقَالَ ادْخُلُوهَا. فَهَمُّوا، وَجَعَلَ بَعْضُهُمْ يُمْسِكُ بَعْضًا، وَيَقُولُونَ فَرَرْنَا إِلَى النَّبِىِّ ﷺ مِنَ النَّارِ. فَمَا زَالُوا حَتَّى خَمَدَتِ النَّارُ، فَسَكَنَ غَضَبُهُ، فَبَلَغَ النَّبِىَّ ﷺ فَقَالَ: «لَوْ دَخَلُوهَا مَا خَرَجُوا مِنْهَا إِلَى يَوْمِ الْقِيَامَةِ، الطَّاعَةُ فِى الْمَعْرُوفِ». [رواه البخاري: ٤٣٤٠]

---

[1] Bunu deməklə onlar müsəlman olduqlarını bildirmişdilər. Belə ki, o vaxt müşriklər dədə-babalarının dinindən dönüb Peyğəmbərə ﷺ qoşulanlara “sabii” (dininə dönük çıxmış adam) deyirdilər. Bu hədisdə də İslam dinini qəbul etmək istəyən müşriklər öz terminlərinə uyğun olaraq: “Sabənə, sabənə” yəni, “Dinimizi tərk edib müsəlman olduq”- dedilər.

**1667.** Rəvayət edilir ki, Əli (ibn Əbu Talib) ﵁ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ ənsardan birisini bir dəstəyə başçı təyin edib onları (döyüşə) göndərdi və onlara (əmirə) tabe olmağı buyurdu. (Yolda) həmin adam qəzəbləndi və onlara dedi: “Məgər Peyğəmbər ﷺ sizə mənə itaət etməyi əmr etməmişdimi?” Onlar: “Elədir!”– dedilər. Onda o, onlara: “Elə isə mənim üçün odun yığın!”– deyə buyurdu, onlar da (lazımi qədər odun) yığdılar. Sonra (onlara): “Od qalayın!”– dedi, onlar da od qaladılar. (Axırda) onlara: “Girin oda!”– dedi. (Əvvəl onlar oda) girmək istədilər, lakin sonra bir-birilərinin qolundan dartıb dedilər: “Biz atəşdən xilas olmaq üçün Peyğəmbərə ﷺ tabe olmuşuq.” Onlar alov səngiyənədək və (əmirin) qəzəbi soyuyanadək tutduqları mövqedə qaldılar. Bu xəbər Peyğəmbərə ﷺ çatdıqda o dedi: “Əgər onlar atəşə girsəydilər, Qiyamət gününədək oradan çıxa bilməzdilər. (Yalnız) şəriətin buyurduğuna itaət etmək gərəkdir!” (əl-Buxari, 4340)

## ٣٥– باب: بَعْثُ أَبِى مُوسَى وَمُعَاذ ﵄ إِلَى الْيَمَنِ قَبْلَ حَجَّةِ الْوَدَاعِ

## 35-ci fəsil. Vida həccindən əvvəl Əbu Musanın və Muazın ﵄ Yəmənə göndərilməsi

١٦٦٨ – عَنْ أَبِى بُرْدَةَ ﵁ قَالَ: بَعَثَ رَسُولُ اللَّهِ ﷺ أَبَا مُوسَى وَمُعَاذَ بْنَ جَبَلٍ إِلَى الْيَمَنِ، قَالَ وَبَعَثَ كُلَّ وَاحِدٍ مِنْهُمَا عَلَى مِخْلاَفٍ قَالَ وَالْيَمَنُ مِخْلاَفَانِ ثُمَّ قَالَ: «يَسِّرَا وَلاَ تُعَسِّرَا، وَبَشِّرَا وَلاَ تُنَفِّرَا». فَانْطَلَقَ كُلُّ وَاحِدٍ مِنْهُمَا إِلَى عَمَلِهِ، وَكَانَ كُلُّ وَاحِدٍ مِنْهُمَا إِذَا سَارَ فِى أَرْضِهِ كَانَ قَرِيبًا مِنْ صَاحِبِهِ أَحْدَثَ بِهِ عَهْدًا، فَسَلَّمَ عَلَيْهِ، فَسَارَ مُعَاذٌ فِى أَرْضِهِ قَرِيبًا مِنْ صَاحِبِهِ أَبِى مُوسَى، فَجَاءَ يَسِيرُ عَلَى بَغْلَتِهِ حَتَّى انْتَهَى إِلَيْهِ، وَإِذَا هُوَ جَالِسٌ، وَقَدِ اجْتَمَعَ إِلَيْهِ النَّاسُ، وَإِذَا رَجُلٌ عِنْدَهُ قَدْ جُمِعَتْ يَدَاهُ إِلَى عُنُقِهِ فَقَالَ لَهُ مُعَاذٌ يَا عَبْدَ اللَّهِ بْنَ قَيْسٍ، أَيَّمَ هَذَا قَالَ هَذَا رَجُلٌ كَفَرَ بَعْدَ إِسْلاَمِهِ. قَالَ لاَ أَنْزِلُ حَتَّى يُقْتَلَ. قَالَ إِنَّمَا جِىءَ بِهِ لِذَلِكَ فَانْزِلْ. قَالَ مَا أَنْزِلُ حَتَّى يُقْتَلَ فَأَمَرَ بِهِ فَقُتِلَ ثُمَّ نَزَلَ فَقَالَ يَا عَبْدَ اللَّهِ، كَيْفَ تَقْرَأُ الْقُرْآنَ قَالَ أَتَفَوَّقُهُ تَفَوُّقًا. قَالَ فَكَيْفَ تَقْرَأُ أَنْتَ يَا مُعَاذُ قَالَ أَنَامُ أَوَّلَ اللَّيْلِ فَأَقُومُ وَقَدْ قَضَيْتُ جُزْئِى مِنَ النَّوْمِ، فَأَقْرَأُ مَا كَتَبَ اللَّهُ لِى، فَأَحْتَسِبُ نَوْمَتِى كَمَا أَحْتَسِبُ قَوْمَتِى. [رواه البخاري: ٤٣٤١-٤٣٤٢]

**1668.** Rəvayət edilir ki, Əbu Burdə ﵁ demişdir: “Peyğəmbər ﷺ Əbu Musanı və Muaz ibn Cəbəli Yəmənə göndərdi, onların hər birini Yəmənin ayrı-ayrı əyalətlərinə canişin təyin etdi, – o vaxt Yəmən cəmi iki əyalətdən ibarət idi – sonra dedi: “Asanlaşdırın, çətinləşdirməyin! Müjdələyin, nifrət oyatmayın!” Bundan sonra onların hər biri öz işinin dalınca getdi. Onlardan hər biri öz bölgəsində gəzib dolaşdığı zaman nə vaxt dostunun bölgəsinə yaxınlaşardısa, yenidən dostuna baş çəkib ona salam verərdi. (Yenə bir dəfə) Muaz öz bölgəsində gəzib dolaşarkən dostu Əbu Musanın bölgəsinə yaxınlaşdı, qatırına minib onun yanına gəldi. Baxdı ki, Əbu Musa yerdə oturub, camaat onun başına yığışıb, bir nəfər də əlləri boynuna kəndirlənmiş vəziyyətdə onun yanında durub. Muaz soruşdu: “Ey Abdullah ibn Qeys, bu nədir?” Əbu Musa (cavabında) dedi: “Bu, İslamı qəbul etdikdən sonra kafir olmuş bir adamdır.” Muaz dedi: “(Bu kafir) edam edilməyincə mən (minikdən) düşən deyiləm.” Əbu Musa dedi: “Onu elə buna görə bura gətiriblər, düş ye-

rə!" Muaz (yenə) dedi: "O edam olunmayınca mən (yerə) düşməyəcəyəm." Əbu Musanın əmri ilə həmin adam edam edildikdən sonra Muaz (minikdən) yerə endi və dedi: "Ey Abdullah, sən Quranı necə oxuyursan?" Əbu Musa dedi: "Mən onu ayrı-ayrı vaxtlarda, hissə-hissə oxuyuram." (Sonra) Əbu Musa (ondan) soruşdu: "Bəs sən Quranı necə oxuyursan, ey Muaz?" Muaz dedi: "Mən gecənin birinci yarısını yatıb yuxumu alıram, sonra da (qalxıb) Allahın mənim üçün əzəldən yazdığı qədər (Quran) oxuyuram. Mən qiyamda durmağımın mükafatını umduğum kimi, yatmağımın mükafatını da (ancaq Allahdan) umuram." (əl-Buxari, 4341-4342)

١٦٦٩ – عَنْ أَبِى مُوسَى الأَشْعَرِىِّ ﵁ أَنَّ النَّبِىَّ ﷺ بَعَثَهُ إِلَى الْيَمَنِ، فَسَأَلَهُ عَنْ أَشْرِبَةٍ تُصْنَعُ بِهَا، فَقَالَ: «وَمَا هِىَ؟» قَالَ الْبِتْعُ وَالْمِزْرُ. فَقُلْتُ لأَبِى بُرْدَةَ مَا الْبِتْعُ قَالَ نَبِيذُ الْعَسَلِ، وَالْمِزْرُ نَبِيذُ الشَّعِيرِ. فَقَالَ: «كُلُّ مُسْكِرٍ حَرَامٌ». [رواه البخاري: ٤٣٤٣]

**1669.** Əbu Musa əl-Əşari ﵁ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ onu Yəmənə göndərdikdə Əbu Musa ondan orada düzəldilən içkilər barədə soruşdu. Peyğəmbər ﷺ soruşdu: "Nədir o?" Əbu Musa: "Bit və mizrdir"– dedi. Onda Peyğəmbər ﷺ buyurdu: "Sərxoşedici hər bir şey haramdır."

(Hədisi danışan ravi demişdir): "Mən Əbu Burdədən soruşdum: "Bit nədir?" Dedi: "Bal şərabıdır." Soruşdum: "Bəs mizr nədir?" Dedi: "Arpa şərabıdır." (əl-Buxari, 4343)

## 36-cı fəsil. Vida həccindən əvvəl Əli ibn Əbu Talibin və Xalid ibn Vəlidin ﵄ Yəmənə göndərilməsi

## ٣٦– باب: بَعْثُ عَلِيِّ بْنِ أَبِى طَالِبٍ وَخَالِدِ بْنِ الْوَلِيدِ ﵄ إِلَى الْيَمَنِ قَبْلَ حَجَّةِ الْوَدَاعِ

١٦٧٠ – عَنِ الْبَرَاءِ ﵁ قَالَ: بَعَثَنَا رَسُولُ اللَّهِ ﷺ مَعَ خَالِدِ بْنِ الْوَلِيدِ إِلَى الْيَمَنِ، قَالَ ثُمَّ بَعَثَ عَلِيًّا بَعْدَ ذَلِكَ مَكَانَهُ فَقَالَ مُرْ أَصْحَابَ خَالِدٍ، مَنْ شَاءَ مِنْهُمْ أَنْ يُعَقِّبَ مَعَكَ فَلْيُعَقِّبْ، وَمَنْ شَاءَ فَلْيُقْبِلْ. فَكُنْتُ فِيمَنْ عَقَّبَ مَعَهُ، قَالَ: فَغَنِمْتُ أَوَاقٍ ذَوَاتِ عَدَدٍ. [رواه البخاري: ٤٣٤٩]

**1670.** Rəvayət edilir ki, Bəra ﵁ demişdir: "Peyğəmbər ﷺ bizi Xalid ibn Vəlidlə birlikdə Yəmənə göndərdi. Sonra onu əvəz etsin deyə Əlini göndərdi və (ona belə) buyurdu: "Xalidin yanında olan əshabələrə deyərsən ki, kim səninlə (Yəməndə) qalmaq istəyirsə, qoy qalsın, kim də (Mədinəyə) qayıtmaq istəyirsə, qoy qayıtsın." Mən Əlinin yanında qalanlardan idim. Sonra (qənimətdən) mənə bir neçə övqiyə[1] pay çatdı." (əl-Buxari, 4349)

١٦٧١ – عَنْ بُرَيْدَةَ ﵁ قَالَ: بَعَثَ النَّبِىُّ ﷺ عَلِيًّا إِلَى خَالِدٍ لِيَقْبِضَ الْخُمُسَ وَكُنْتُ أُبْغِضُ عَلِيًّا، وَقَدِ اغْتَسَلَ، فَقُلْتُ لِخَالِدٍ أَلاَ تَرَى إِلَى هَذَا فَلَمَّا قَدِمْنَا عَلَى النَّبِىِّ ﷺ ذَكَرْتُ ذَلِكَ لَهُ فَقَالَ: «يَا بُرَيْدَةُ أَتُبْغِضُ عَلِيًّا». فَقُلْتُ نَعَمْ. قَالَ: «لاَ تُبْغِضْهُ فَإِنَّ لَهُ فِى الْخُمُسِ أَكْثَرَ مِنْ ذَلِكَ». [رواه البخاري: ٤٣٥٠]

---

[1] 708-ci hədisin qeydlərinə bax.

**1671.** Rəvayət edilir ki, Bureydə ﷺ demişdir: “Peyğəmbər ﷺ Əlini Xalidin yanına göndərdi ki, qənimətlərin beşdə bir hissəsini (ondan) götürsün. O ərəfədə mən Əliyə nifrət edirdim. O, qüsl etdikdən[1] sonra mən Xalidə dedim: “Bunun (nə etdiyini) görmürsənmi?” Biz Peyğəmbərin ﷺ yanına gəldikdə mən Əlinin nə etdiyini ona xəbər verdim.” Peyğəmbər ﷺ dedi: “Ey Bureydə, sən Əliyə nifrətmi edirsən?” Mən: “Bəli”– deyə cavab verdim. Peyğəmbər ﷺ buyurdu: “Ona nifrət eləmə! Həqiqətən, xümsdən onun payına bundan artığı çatır.” (əl-Buxari, 4350)

**١٦٧٢** – عَنْ أَبي سَعِيد الْخُدْرِيَّ ﷺ قَالَ: بَعَثَ عَلِيُّ بْنُ أَبِى طَالِب ﷺ إِلَى رَسُول اللَّه ﷺ منَ الْيَمَن بذُهَيْبَة فِى أَدِيمٍ مَقْرُوظ لَمْ تُحَصَّلْ منْ تُرَابِهَا، قَالَ فَقَسَمَهَا بَيْنَ أَرْبَعَة نَفَر بَيْنَ عُيَيْنَةَ بْن بَدْر، وَأَقْرَعَ بْن حَابس وَزَيْد الْخَيْل، وَالرَّابعُ إِمَّا عَلْقَمَةُ وَإِمَّا عَامرُ بْنُ الطُّفَيْل، فَقَالَ رَجُلٌ منْ أَصْحَابه كُنَّا نَحْنُ أَحَقَّ بهَذَا منْ هَؤُلاَء. قَالَ فَبَلَغَ ذَلكَ النَّبِيَّ ﷺ فَقَالَ: «أَلاَ تَأْمَنُونِى وَأَنَا أَمِينُ مَنْ فِى السَّمَاء، يَأْتِينِى خَبَرُ السَّمَاء صَبَاحًا وَمَسَاءً». قَالَ فَقَامَ رَجُلٌ غَائرُ الْعَيْنَيْن، مُشْرفُ الْوَجْنَتَيْن، نَاشزُ الْجَبْهَة، كَثُّ اللِّحْيَة، مَحْلُوقُ الرَّأْس، مُشَمَّرُ الإِزَار، فَقَالَ يَا رَسُولَ اللَّه، اتَّق اللَّهَ. قَالَ: «وَيْلَكَ أَوَلَسْتُ أَحَقَّ أَهْلِ الأَرْضِ أَنْ يَتَّقِىَ اللَّهَ». قَالَ ثُمَّ وَلَّى الرَّجُلُ، قَالَ خَالدُ بْنُ الْوَلِيد يَا رَسُولَ اللَّه، أَلاَ أَضْربُ عُنُقَهُ قَالَ: «لاَ، لَعَلَّهُ أَنْ يَكُونَ يُصَلِّى». فَقَالَ خَالدٌ وَكَمْ منْ مُصَلٍّ يَقُولُ بلسَانه مَا لَيْسَ فِى قَلْبه. قَالَ رَسُولُ اللَّه ﷺ: «إِنِّى لَمْ أُومَرْ أَنْ أَنْقُبَ قُلُوبَ النَّاس، وَلاَ أَشُقَّ بُطُونَهُمْ» قَالَ ثُمَّ نَظَرَ إِلَيْه وَهُوَ مُقَفٍّ فَقَالَ: «إِنَّهُ يَخْرُجُ منْ ضئْضئِ هَذَا قَوْمٌ يَتْلُونَ كتَابَ اللَّه رَطْبًا، لاَ يُجَاوزُ حَنَاجرَهُمْ، يَمْرُقُونَ منَ الدِّين كَمَا يَمْرُقُ السَّهْمُ منَ الرَّميَّة». وَأَظُنُّهُ قَالَ: «لَئنْ أَدْرَكْتُهُمْ لأَقْتُلَنَّهُمْ قَتْلَ ثَمُودَ». [رواه البخاري: ٤٣٥١]

**1672.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: “Əli ibn Əbu Talib Peyğəmbərə ﷺ Yəməndən aşılanmış dəridən hazırlanmış kisənin içində qızıl külçələr göndərdi. Peyğəmbər ﷺ bu külçələri dörd nəfərin arasında bölüşdürdü. (Bir hissəsini) Uyeynə ibn Bədrə, (ikinci hissəsini) Əqra ibn Habisə, (üçüncü hissəsini) Zeyd əl-Xeylə, dördüncü hissəsini də ya Əlqəməyə, ya da Amir ibn Tufeylə (verdi). Bu vaxt Peyğəmbərin ﷺ əshabələrindən biri dedi: “Bizim bu (qənimətlərə) onlardan daha çox haqqımız çatırdı.” Bu söz Peyğəmbərə ﷺ yetişdikdə o dedi: “Mən göydəki Allahın etibar etdiyi bir adam ola-ola, üstəlik səhər-axşam mənə vəhy nazil olduğu halda siz mənə etibar etmirsiniz?!” Bu vaxt gözləri batıq, almacıq sümükləri[2] çıxıq, alnı qabarıq, gursaqqal, başı qırxıq, izarını yuxarı çəkmiş bir adam ayağa qalxıb dedi: “Ya Rəsulullah, Allahdan qorx!” Peyğəmbər ﷺ dedi: “Vay sənin halına! Məgər mən yer üzündə olan insanların ən təqvalısı deyiləmmi?” Sonra həmin adam dönüb getdi. Bu vaxt Xalid ibn Vəlid dedi: “Ya Rəsulullah, onun boynunu vurummu?” Peyğəmbər ﷺ dedi: “Xeyr, ola bilsin ki, o namaz qılan adam olsun.” Xalid dedi: “Nə çox namaz qılan var ki, qəlbən etiqad etmədiyini dilinə gətirir.” Peyğəmbər ﷺ buyurdu: “Mənə insanların qəlbinə girmək, onların köksünü açmaq əmr edilməmişdir.” Sonra Peyğəmbər ﷺ həmin adamın arxasınca baxıb dedi: “Həqiqətən, bu adamın belindən elə insanlar gələcək ki, onlar

---

[1] Əli ibn Əbu Talib ﷺ cariyələrdən birini özünə götürmüş və orada qaldığı gecəni onunla keçirmiş və elə bu səbəbdən də o qüsl etmişdir.

[2] Gözlərin altında, çənənin üstündəki çıxıq, yanaq sümüklərinin dik yeri.

Allahın Kitabını məlahətli səslə oxuyacaq, lakin oxuduqları xirtdəklərindən o yana keçməyəcəkdir. Ox öz ovunu dəlib keçdiyi kimi onlar da İslamdan çıxacaqlar." Deyəsən, Peyğəmbər ﷺ bunu da demişdir ki: "Əgər mən onların (meydana gələcəyi günədək) yaşasam, onları Səmud qəbiləsinin öldürüldüyü kimi, öldürərəm." (əl-Buxari, 4351)

## 37-ci fəsil. Zul-Xələsə döyüşü

## ٣٧– باب: غَزْوَةُ ذِى الْخَلَصَةِ

١٦٧٣ – عَنْ جَرِيرٍ رضي الله عنه قَالَ: قَالَ لِى رَسُولُ اللَّهِ ﷺ: «أَلاَ تُرِيحُنِى مِنْ ذِى الْخَلَصَةِ؟» فَقُلْتُ بَلَى. فَانْطَلَقْتُ فِى خَمْسِينَ وَمِائَةِ فَارِسٍ مِنْ أَحْمَسَ وَكَانُوا أَصْحَابَ خَيْلٍ وَكُنْتُ لاَ أَثْبُتُ عَلَى الْخَيْلِ، فَذَكَرْتُ ذَلِكَ لِلنَّبِىِّ ﷺ فَضَرَبَ يَدَهُ عَلَى صَدْرِى حَتَّى رَأَيْتُ أَثَرَ يَدِهِ فِى صَدْرِى وَقَالَ: «اللَّهُمَّ ثَبِّتْهُ وَاجْعَلْهُ هَادِيًا مَهْدِيًّا». قَالَ فَمَا وَقَعْتُ عَنْ فَرَسٍ بَعْدُ. قَالَ وَكَانَ ذُو الْخَلَصَةِ بَيْتًا بِالْيَمَنِ لِخَثْعَمَ وَبَجِيلَةَ، فِيهِ نُصُبٌ تُعْبَدُ ، يُقَالُ لَهُ الْكَعْبَةُ. قَالَ فَأَتَاهَا فَحَرَّقَهَا بِالنَّارِ وَكَسَرَهَا. قَالَ وَلَمَّا قَدِمَ جَرِيرٌ الْيَمَنَ كَانَ بِهَا رَجُلٌ يَسْتَقْسِمُ بِالأَزْلاَمِ فَقِيلَ لَهُ إِنَّ رَسُولَ رَسُولِ اللَّهِ ﷺ هَا هُنَا فَإِنْ قَدَرَ عَلَيْكَ ضَرَبَ عُنُقَكَ. قَالَ فَبَيْنَمَا هُوَ يَضْرِبُ بِهَا إِذْ وَقَفَ عَلَيْهِ جَرِيرٌ فَقَالَ لَتَكْسِرَنَّهَا وَلَتَشْهَدَنَّ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ أَوْ لأَضْرِبَنَّ عُنُقَكَ. قَالَ فَكَسَرَهَا وَشَهِدَ، ثُمَّ بَعَثَ جَرِيرٌ رَجُلاً مِنْ أَحْمَسَ يُكْنَى أَبَا أَرْطَاةَ إِلَى النَّبِىِّ ﷺ يُبَشِّرُهُ بِذَلِكَ، فَلَمَّا أَتَى النَّبِىَّ ﷺ قَالَ: يَا رَسُولَ اللَّهِ وَالَّذِى بَعَثَكَ بِالْحَقِّ مَا جِئْتُ حَتَّى تَرَكْتُهَا كَأَنَّهَا جَمَلٌ أَجْرَبُ. قَالَ فَبَرَّكَ النَّبِىُّ ﷺ عَلَى خَيْلِ أَحْمَسَ وَرِجَالِهَا خَمْسَ مَرَّاتٍ. [رواه البخاري: ٤٣٥٧]

**1673.** Rəvayət edilir ki, Cərir رضي الله عنه demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ mənə dedi: "Zul-Xələsəni (yox etməklə) mənim qəlbimi rahat etmək istəmirsənmi?" Dedim: "Əlbəttə, (istəyirəm)." Sonra mən Əhməs qəbiləsindən olan yüz əlli nəfərlik bir süvari dəstəsində (oraya) yollandım. Əhməsilər yaxşı at sürən adamlar idi. Mən isə atın belində dura bilmirdim. Mən bunu Peyğəmbərə ﷺ bildirdikdə o, (əli ilə) mənim sinəmə elə bir zərbə vurdu ki, barmaqlarının izi sinəmdə qaldı, (sonra da dua edib) dedi: "Allahım, onu sabitqədəm et, onu doğru yol göstərən və doğru yolda olan (kimsələrdən) et!" Bundan sonra mən heç vaxt atdan yıxılmadım. Zul-Xələsəyə gəlincə, bu, Yəməndə yerləşən, Xəsəm və Bəcilə qəbilələrinə məxsus, onların kəbə adlandırdıqları bir bütxana idi. Cərir o bütxanaya getdi və onu yandırıb darmadağın etdi. Cərir Yəmənə gəldikdə orada oxlarla fala baxan bir adam var idi. Ona dedilər ki, Rəsulullahın ﷺ elçisi buradadır. Əgər o səni yaxalasa, sənin boynunu vuracaq. (Lakin adam deyilənlərə məhəl qoymayıb işinə davam elədi. Bir dəfə yenə oxlarla) fala baxdıqda Cərir qəfil onun başının üstünü aldı və dedi: "Ya bu oxları sındıracaq və "lə ilahə illəllah" deyəcəksən, ya da sənin boynunu vuracağam." (Falçı dərhal) oxları sındırıb şəhadət gətirdi. Sonra Cərir Əbu Ərtat ləqəbli bir əhməslini Peyğəmbərin ﷺ yanına göndəri ki, bu xeyir xəbərlə ona müjdə versin. Əbu Ərtat Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, səni haqq ilə göndərən Allaha and olsun ki, mən gələndə o (bütxana) haldan düşmüş (və ya qotur xəstəliyinə) tutulmuş bir dəvə kimi (yanıb qapqara) olmuşdu."

(Cərir) dedi: "(Bunu eşidəndə) Peyğəmbər ﷺ əhməsilərin atlı və piyada qoşunu üçün beş dəfə xeyir-bərəkət dilədi." (əl-Buxari, 4357)

## ٣٨- باب: ذَهَابُ جَرِيرٍ ﷺ إِلَى الْيَمَنِ

## 38-ci fəsil. Cəririn ﷺ Yəmənə getməsi

١٦٧٤ – عَنْ جَرِيرٍ ﷺ قَالَ: كُنْتُ بِالْيَمَنِ فَلَقِيتُ رَجُلَيْنِ مِنْ أَهْلِ الْيَمَنِ ذَا كَلاَعٍ وَذَا عَمْرٍو، فَجَعَلْتُ أُحَدِّثُهُمْ عَنْ رَسُولِ اللَّهِ ﷺ فَقَالَ لَهُ ذُو عَمْرٍو لَئِنْ كَانَ الَّذِى تَذْكُرُ مِنْ أَمْرِ صَاحِبِكَ، لَقَدْ مَرَّ عَلَى أَجَلِهِ مُنْذُ ثَلاَثٍ. وَأَقْبَلاَ مَعِى حَتَّى إِذَا كُنَّا فِى بَعْضِ الطَّرِيقِ رُفِعَ لَنَا رَكْبٌ مِنْ قِبَلِ الْمَدِينَةِ فَسَأَلْنَاهُمْ فَقَالُوا قُبِضَ رَسُولُ اللَّهِ ﷺ وَاسْتُخْلِفَ أَبُو بَكْرٍ وَالنَّاسُ صَالِحُونَ. فَقَالاَ أَخْبِرْ صَاحِبَكَ أَنَّا قَدْ جِئْنَا وَلَعَلَّنَا سَنَعُودُ إِنْ شَاءَ اللَّهُ، وَرَجَعَا إِلَى الْيَمَنِ فَأَخْبَرْتُ أَبَا بَكْرٍ بِحَدِيثِهِمْ قَالَ أَفَلاَ جِئْتَ بِهِمْ. فَلَمَّا كَانَ بَعْدُ قَالَ لِى ذُو عَمْرٍو يَا جَرِيرُ إِنَّ بِكَ عَلَىَّ كَرَامَةً، وَإِنِّى مُخْبِرُكَ خَبَرًا، إِنَّكُمْ مَعْشَرَ الْعَرَبِ لَنْ تَزَالُوا بِخَيْرٍ مَا كُنْتُمْ إِذَا هَلَكَ أَمِيرٌ تَأَمَّرْتُمْ فِى آخَرَ، فَإِذَا كَانَتْ بِالسَّيْفِ كَانُوا مُلُوكًا يَغْضَبُونَ غَضَبَ الْمُلُوكِ وَيَرْضَوْنَ رِضَا الْمُلُوكِ. [رواه البخاري: ٤٣٥٩]

**1674.** Rəvayət edilir ki, Cərir ﷺ demişdir: "(Bir dəfə) mən Yəməndə olarkən orada Zu Kəla və Zu Amr adlı iki yəmənliyə rast gəldim və onlara Allahın elçisi ﷺ barəsində danışdım. Zu Amr mənə dedi: "Əgər sənin dostun barədə danışdıqların doğrudursa, demək o, artıq üç gün bundan qabaq vəfat etmişdir.[1]" Sonra hər ikisi mənimlə birlikdə (Mədinəyə) yola düşdü. Nəhayət, yolda Mədinədən gələn atlılara rast gəldik və onlardan (Peyğəmbər ﷺ) haqqında soruşduq. Onlar dedilər: "Allahın elçisi ﷺ vəfat etmiş və ondan sonra Əbu Bəkr xəlifə seçilmişdir. Camaatın yaşayışı da çox yaxşıdır." Onda Zu Kəla və Zu Amr: "Dostuna[2] deyərsən ki, biz gəlmişdik, bəlkə, inşallah yenə qayıdıb gəldik"– dedilər, sonra da Yəmənə qayıtdılar. Mən onların dediklərini Əbu Bəkrə xəbər verdim. Əbu Bəkr dedi: "Nahaq onları özünlə gətirməmisən!" (Ömərin xilafəti dövründə) Zu Amr (Mədinəyə gəldikdə) mənə dedi: "Ey Cərir! Doğrudan da, sən mənə böyük ehtiram göstərmisən. Odur ki, mən sənə bir (şey haqqında) xəbər verəcəyəm. Siz ərəblər əvvəlki xəlifə vəfat etdiyi təqdirdə sonrakı xəlifəni (şəriətə uyğun şəkildə) seçənədək xeyir-bərəkət içində yaşayacaqsınız. Xilafət qılınc sayəsində ələ keçirildiyi zaman artıq (seçilənlər xəlifə yox,) padşah olacaqlar. Onlar padşahlar kimi qəzəblənəcək, habelə padşahlar kimi razı qalacaqlar." (əl-Buxari, 4359)

## ٣٩- باب: غَزْوَةُ سِيفِ الْبَحْرِ

## 39-cu fəsil. Dəniz sahilindəki döyüş

١٦٧٥ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ: بَعَثَ رَسُولُ اللَّهِ ﷺ بَعْثًا قِبَلَ السَّاحِلِ وَأَمَّرَ عَلَيْهِمْ أَبَا عُبَيْدَةَ بْنَ الْجَرَّاحِ وَهُمْ ثَلاَثُمِائَةٍ، فَخَرَجْنَا وَكُنَّا بِبَعْضِ الطَّرِيقِ فَنِىَ الزَّادُ فَأَمَرَ أَبُو عُبَيْدَةَ بِأَزْوَادِ الْجَيْشِ، فَجُمِعَ فَكَانَ مِزْوَدَىْ تَمْرٍ، فَكَانَ يَقُوتُنَا كُلَّ يَوْمٍ قَلِيلٌ قَلِيلٌ حَتَّى فَنِىَ، فَلَمْ يَكُنْ يُصِيبُنَا إِلاَّ تَمْرَةٌ تَمْرَةٌ فَقُلْتُ مَا تُغْنِى عَنْكُمْ تَمْرَةٌ فَقَالَ لَقَدْ وَجَدْنَا فَقْدَهَا حِينَ فَنِيَتْ. ثُمَّ انْتَهَيْنَا إِلَى الْبَحْرِ، فَإِذَا حُوتٌ مِثْلُ الظَّرِبِ فَأَكَلَ مِنْهَا الْقَوْمُ ثَمَانَ عَشْرَةَ لَيْلَةً، ثُمَّ أَمَرَ أَبُو عُبَيْدَةَ بِضِلَعَيْنِ مِنْ أَضْلاَعِهِ فَنُصِبَا، ثُمَّ أَمَرَ بِرَاحِلَةٍ فَرُحِلَتْ ثُمَّ مَرَّتْ تَحْتَهُمَا فَلَمْ تُصِبْهُمَا. [رواه البخاري: ٤٣٦٠]

---

[1] Çox güman ki, bu adam kahin idi.
[2] Burada Əbu Bəkr ﷺ nəzərdə tutulur.

**1675.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "(Bir zaman) Peyğəmbər ﷺ üç yüz nəfərdən ibarət qoşuna Əbu Ubeydə ibn Cərrahı başçı təyin edib onları dənizin sahilinə tərəf yolladı. Biz (Mədinədən) yola düşdük və (nəhayət,) yolun bir hissəsini qət etdikdən sonra ərzağımız qurtarmağa başladı. Onda Əbu Ubeydənin əmri ilə qoşunun bütün ehtiyat ərzağı bir yerə cəm edildi və cəmi iki xurcun xurma yığıldı. Əbu Ubeydə hər gün bu xurmalardan bizə az-az verməyə başladı və iş o yerə gəlib çatdı ki, hər kəsə ancaq bir dənə xurma çatdı."

(Hədisi danışan ravi dedi): "Mən soruşdum: "Bir xurmanın sizə nə faydası olurdu ki?" Cabir dedi: "Artıq o da tükəndikdə biz onun yoxluğunu hiss etdik. Sonra biz gəlib dənizin sahilinə çatdıq və orada dağ boyda bir balıq gördük. Camaat on səkkiz gün o balıqdan yedi. Sonra Əbu Ubeydənin əmri ilə balığın qabırğalarından ikisini dikəltdilər. Sonra (yenə) onun əmri ilə (ən hündürboy) atlı bu qabırğaların altından keçdi və onun başı bu sümüklərə dəymədi." (əl-Buxari, 4360)

**١٦٧٦ –** وَ فِي رِوَايَةٍ عَنْهُ قَال: فَأَلْقَى لَنَا الْبَحْرُ دَابَّةً يُقَالُ لَهَا الْعَنْبَرُ، فَأَكَلْنَا مِنْهُ نِصْفَ شَهْرٍ وَادَّهَنَّا مِنْ وَدَكِهِ حَتَّى ثَابَتْ إِلَيْنَا أَجْسَامُنَا.

وَ فِي رِوَايَةٍ عَنْهُ: قَالَ أَبُو عُبَيْدَةَ كُلُوا. فَلَمَّا قَدِمْنَا الْمَدِينَةَ ذَكَرْنَا ذَلِكَ لِلنَّبِيِّ ﷺ فَقَالَ: «كُلُوا رِزْقًا أَخْرَجَهُ اللَّهُ، أَطْعِمُونَا إِنْ كَانَ مَعَكُمْ». فَأَتَاهُ بَعْضُهُمْ بِعُضْوٍ فَأَكَلَهُ. [رواه البخاري: ٤٣٦١-٤٣٦٢]

**1676.** Digər rəvayətdə Cabir رضي الله عنه demişdir: "Dəniz bizim üçün sahilə Ənbər[1] adlı bir balıq çıxartdı. Biz düz yarım ay o balıqdan yedik, üstəlik piyindən dərimizə o qədər sürtdük ki, nəhayət, bədənimiz əvvəlki formasına düşdü."

Digər rəvayətdə Cabir رضي الله عنه demişdir: "Əbu Ubeydə (bizə): "Yeyin!"- deyə buyurdu. Biz Mədinəyə gəldikdə başımıza gələnləri Peyğəmbərə ﷺ danışdıq. Peyğəmbər ﷺ dedi: "Allahın sizə verdiyi ruzidən yeyin və əgər (artıq) qalıbsa, bizi də qonaq edin!" (Əshabələrdən) biri (balığın ətindən) bir tikə Peyğəmbərə ﷺ verdi və o da (bu ətdən) daddı." (əl-Buxari, 4361-4362)

## 40-cı fəsil. Uyeynə ibn Hisnin üstünə yürüş

## ٤٠– باب: غَزْوَةُ عُيَيْنَةَ بْنِ حِصْنٍ

**١٦٧٧ –** عَنْ عَبْدَ اللَّه بْنَ الزُّبَيْر رضي الله عنهما قَالَ: قَدِمَ رَكْبٌ مِنْ بَنِي تَمِيمٍ عَلَى النَّبِيِّ ﷺ فَقَالَ أَبُو بَكْرٍ: أَمِّرِ الْقَعْقَاعَ بْنَ مَعْبَدِ بْنِ زُرَارَةَ. قَالَ عُمَرُ بَلْ أَمِّرِ الأَقْرَعَ بْنَ حَابِسٍ. قَالَ أَبُو بَكْرٍ مَا أَرَدْتَ إِلاَّ خِلاَفِي. قَالَ عُمَرُ مَا أَرَدْتُ خِلاَفَكَ. فَتَمَارَيَا حَتَّى ارْتَفَعَتْ أَصْوَاتُهُمَا فَنَزَلَ فِي ذَلِكَ: ﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تُقَدِّمُواْ﴾ حَتَّى انْقَضَتْ. [رواه البخاري: ٤٣٦٧]

**1677.** Rəvayət edilir ki, Abdullah ibn Zubeyr رضي الله عنهما demişdir: "Bəni Təmim qəbiləsindən bir dəstə atlı Peyğəmbərin ﷺ yanına gəldikdə Əbu Bəkr dedi: "əl-Qa'qa ibn Məbəd ibn Zuraranı başçı təyin et!" Ömər isə dedi: "Yox, Əqra ibn Habisi başçı təyin et!" Bu vaxt Əbu Bəkr Ömərə: "Sən ancaq mənə müxalif olmaq istəyirsən!"– dedi. Ömər də ona: "Mən sənə müxalif olmaq istəmə-

[1] Kitlər qrupundan məməli iri dəniz heyvanı.

dim!"– dedi. Beləliklə, onlar mübahisə etməyə başladılar və səslərini qaldırdılar. Onda bu ayə nazil oldu: **"Ey iman gətirənlər!** ***Heç bir şeydə*** **Allahı və Onun Elçisini qabaqlamayın. Allahdan qorxun! Həqiqətən, Allah Eşidəndir, Biləndir"[1].** (əl-Buxari, 4367)

## ٤١ – باب: وَفْدُ بَنِي حَنِيفَةَ، وَحَدِيثُ ثُمَامَةَ بْنِ أُثَالٍ

## 41-ci fəsil. Bəni Hənifə qəbiləsinin nümayəndələri və Sumamə ibn Usalın rəvayəti

١٦٧٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: بَعَثَ النَّبِيُّ ﷺ خَيْلاً قِبَلَ نَجْدٍ، فَجَاءَتْ بِرَجُلٍ مِنْ بَنِي حَنِيفَةَ يُقَالُ لَهُ ثُمَامَةُ بْنُ أُثَالٍ، فَرَبَطُوهُ بِسَارِيَةٍ مِنْ سَوَارِي الْمَسْجِدِ، فَخَرَجَ إِلَيْهِ النَّبِيُّ ﷺ فَقَالَ: «مَا عِنْدَكَ يَا ثُمَامَةُ». فَقَالَ عِنْدِي خَيْرٌ يَا مُحَمَّدُ، إِنْ تَقْتُلْنِي تَقْتُلْ ذَا دَمٍ، وَإِنْ تُنْعِمْ تُنْعِمْ عَلَى شَاكِرٍ، وَإِنْ كُنْتَ تُرِيدُ الْمَالَ فَسَلْ مِنْهُ مَا شِئْتَ. حَتَّى كَانَ الْغَدُ ثُمَّ قَالَ لَهُ: «مَا عِنْدَكَ يَا ثُمَامَةُ». قَالَ مَا قُلْتُ لَكَ إِنْ تُنْعِمْ تُنْعِمْ عَلَى شَاكِرٍ. فَتَرَكَهُ حَتَّى كَانَ بَعْدَ الْغَدِ، فَقَالَ: «مَا عِنْدَكَ يَا ثُمَامَةُ». فَقَالَ عِنْدِي مَا قُلْتُ لَكَ. فَقَالَ: «أَطْلِقُوا ثُمَامَةَ»، فَانْطَلَقَ إِلَى نَخْلٍ قَرِيبٍ مِنَ الْمَسْجِدِ فَاغْتَسَلَ ثُمَّ دَخَلَ الْمَسْجِدَ فَقَالَ أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا رَسُولُ اللَّهِ، يَا مُحَمَّدُ وَاللَّهِ مَا كَانَ عَلَى الأَرْضِ وَجْهٌ أَبْغَضَ إِلَيَّ مِنْ وَجْهِكَ، فَقَدْ أَصْبَحَ وَجْهُكَ أَحَبَّ الْوُجُوهِ إِلَيَّ، وَاللَّهِ مَا كَانَ مِنْ دِينٍ أَبْغَضَ إِلَيَّ مِنْ دِينِكَ، فَأَصْبَحَ دِينُكَ أَحَبَّ الدِّينِ إِلَيَّ، وَاللَّهِ مَا كَانَ مِنْ بَلَدٍ أَبْغَضُ إِلَيَّ مِنْ بَلَدِكَ، فَأَصْبَحَ بَلَدُكَ أَحَبَّ الْبِلاَدِ إِلَيَّ، وَإِنَّ خَيْلَكَ أَخَذَتْنِي وَأَنَا أُرِيدُ الْعُمْرَةَ، فَمَاذَا تَرَى فَبَشَّرَهُ رَسُولُ اللَّهِ ﷺ وَأَمَرَهُ أَنْ يَعْتَمِرَ، فَلَمَّا قَدِمَ مَكَّةَ قَالَ لَهُ قَائِلٌ صَبَوْتَ. قَالَ لاَ، وَلَكِنْ أَسْلَمْتُ مَعَ مُحَمَّدٍ رَسُولِ اللَّهِ ﷺ، وَلاَ وَاللَّهِ لاَ يَأْتِيكُمْ مِنَ الْيَمَامَةِ حَبَّةُ حِنْطَةٍ حَتَّى يَأْذَنَ فِيهَا النَّبِيُّ ﷺ. [رواه البخاري: ٤٣٧٢]

**1678.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "(Bir vaxt) Peyğəmbər ﷺ Nəcdə bir dəstə atlı göndərdi. Onlar oradan Bəni Hənifə qəbiləsindən olan Sumamə ibn Usal adlı bir nəfəri (tutub Mədinəyə gətirdilər və) onu məsciddəki dirəklərdən birinə bağladılar. Bu əsnada Peyğəmbər ﷺ onun yanına gəlib dedi: "Nə düşünürsən, ey Sumamə?" Sumamə dedi: "(Hər şey) yaxşıdır, ey Muhəmməd! Məni öldürsən, əli qana batmış bir canini öldürmüş olarsan. Məni azad etsən, minnətdar olan bir adama yaxşılıq etmiş olarsan. Yox əgər pul istəyirsənsə, dilədiyin qədər istəyə bilərsən." Səhəri gün Peyğəmbər ﷺ (yenə) onun yanına gəlib dedi: "Nə fikirləşirsən, ey Sumamə?" Sumamə dedi: "(Dünən) sənə dediyim kimi, əgər məni azad etsən, minnətdar olan bir adama yaxşılıq etmiş olarsan." Peyğəmbər ﷺ onu qoyub getdi. Ertəsi gün (yenə) onun yanına gəlib dedi. "Nə düşünürsən, ey Sumamə?" Sumamə dedi: "(Dünən) sənə dediklərimi." Peyğəmbər ﷺ: "Sumaməni azad edin!"– dedi, sonra Sumamə məscidin yanındakı xurmalığa gedib qüsl etdi və gəlib məscidə daxil oldu. (Bu vaxt Sumamə ona yaxınlaşıb) dedi: "Mən şahidlik edirəm ki, Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Allahın elçisidir. Ey Muhəmməd, vallahi ki, yer üzündə sənin üzündən daha çox nifrət etdiyim bir üz yox idi. İndi isə sənin üzün mənim üçün ən əziz üzdür. Vallahi, sənin dinindən daha çox nifrət etdiyim bir din yox idi. İndi isə sənin dinin mənim üçün ən əziz bir dindir. Vallahi, sənin şəhə-

[1] "əl-Hucurat" surəsi, 1.

rindən daha çox nifrət etdiyim bir şəhər yox idi. İndi isə sənin şəhərin mənim üçün ən əziz şəhərdir. Mən ümrə etmək istəyərkən sənin atlıların məni yaxaladılar. Bu haqda nə deyə bilərsən?" Peyğəmbər ﷺ onu müjdələdi və ona ümrəni yerinə yetirməyi əmr etdi. Sumamə Məkkəyə gəlib çatdıqda bir nəfər ondan: "Sabiimi[1] olmusan?"– deyə soruşdu. Dedi: "Xeyr, mən Allahın elçisi Muhəmmədlə ﷺ birgə Allaha təslim olmuşam. Allaha and olsun ki, Peyğəmbərin ﷺ izni olmadan Yəmamədən sizə bir buğda dənəsi belə gəlməyəcəkdir." (əl-Buxari, 4372)

١٦٧٩ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَدِمَ مُسَيْلِمَةُ الْكَذَّابُ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ فَجَعَلَ يَقُولُ إِنْ جَعَلَ لِى مُحَمَّدٌ مِنْ بَعْدِهِ تَبِعْتُهُ. وَقَدِمَهَا فِى بَشَرٍ كَثِيرٍ مِنْ قَوْمِهِ، فَأَقْبَلَ إِلَيْهِ رَسُولُ اللَّهِ ﷺ وَمَعَهُ ثَابِتُ بْنُ قَيْسِ بْنِ شَمَّاسٍ، وَفِى يَدِ رَسُولِ اللَّهِ ﷺ قِطْعَةُ جَرِيدٍ حَتَّى وَقَفَ عَلَى مُسَيْلِمَةَ فِى أَصْحَابِهِ، فَقَالَ: «لَوْ سَأَلْتَنِى هَذِهِ الْقِطْعَةَ مَا أَعْطَيْتُكَهَا وَلَنْ تَعْدُوَ أَمْرَ اللَّهِ فِيكَ، وَلَئِنْ أَدْبَرْتَ لَيَعْقِرَنَّكَ اللَّهُ، وَإِنِّى لأَرَاكَ الَّذِى أُرِيتُ فِيهِ مَا رَأَيْتُ، وَهَذَا ثَابِتٌ يُجِيبُكَ عَنِّى». ثُمَّ انْصَرَفَ عَنْهُ. قَالَ ابْنُ عَبَّاسٍ فَسَأَلْتُ عَنْ قَوْلِ رَسُولِ اللَّهِ ﷺ: «إِنَّكَ أُرَى الَّذِى أُرِيتُ فِيهِ مَا أُرِيتُ». فَأَخْبَرَنِى أَبُو هُرَيْرَةَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: «بَيْنَا أَنَا نَائِمٌ رَأَيْتُ فِى يَدَىَّ سِوَارَيْنِ مِنْ ذَهَبٍ، فَأَهَمَّنِى شَأْنُهُمَا، فَأُوحِىَ إِلَىَّ فِى الْمَنَامِ أَنِ انْفُخْهُمَا، فَنَفَخْتُهُمَا فَطَارَا فَأَوَّلْتُهُمَا كَذَّابَيْنِ يَخْرُجَانِ بَعْدِى، أَحَدُهُمَا الْعَنْسِىُّ، وَالآخَرُ مُسَيْلِمَةُ». [رواه البخاري: ٤٣٧٣-٤٣٧٤]

**1679.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbərin dövründə yalançı Müseyləmə Mədinəyə gəlib dedi: "Əgər Muhəmməd özündən sonra (hakimiyyəti) mənə versə, mən onun ardınca gedərəm. Onunla bərabər Mədinəyə onun bir çox həmqəbilələri gəlmişdi. Peyğəmbər ﷺ əlində bir xurma budağı Sabit ibn Qeys ibn Şəmmas ilə birlikdə Müseyləmənin və onun həmqəbilələrinin yanına gəlib dedi: "Əgər sən məndən bu budağı istəsəydin belə, mən onu sənə verməzdim. Sən heç vaxt Allahın əzəldən sənin barəndə verdiyi qərara qarşı çıxa bilməzsən. Əgər (haqdan) üz döndərsən, Allah hökmən səni məhv edəcək. Mən görürürəm ki, sən mənə yuxuda göstərilmiş həmin adamsan. Mənim yerimə Sabit sənin cavabını verəcək." (Peyğəmbər ﷺ sözünü deyəndən) sonra ondan uzaqlaşdı."

İbn Abbas demişdir: "Mən Peyğəmbərin ﷺ: "Mən görürəm ki, sən mənə yuxuda göstərilmiş həmin adamsan" sözünün mənasını soruşmağa başladım. Əbu Hureyra mənə xəbər verdi ki, Peyğəmbər ﷺ demişdir: "(Bir dəfə) mən yuxuda qolumda qızıldan iki bilərzik gördüm və onlar məni bərk narahat elədi. Sonra yuxuda ikən mənə: "Onlara üfür!" deyə vəhy edildi. Mən bilərziklərə üfürdükdə onlar (havaya) uçdular. Mən bu bilərzikləri məndən sonra (peyğəmbərlik iddia edəcək) iki yalançının meydana gələcəyinə yozdum." Biri (Əsvəd) əl-Ənsi, digəri isə Müseyləmə oldu." (əl-Buxari, 4373-4374)

١٦٨٠ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «بَيْنَا أَنَا نَائِمٌ أُتِيتُ بِخَزَائِنِ الأَرْضِ، فَوُضِعَ فِى كَفِّى سِوَارَانِ مِنْ ذَهَبٍ، فَكَبُرَا عَلَىَّ فَأُوحِىَ إِلَىَّ أَنِ انْفُخْهُمَا، فَنَفَخْتُهُمَا فَذَهَبَا فَأَوَّلْتُهُمَا الْكَذَّابَيْنِ اللَّذَيْنِ أَنَا بَيْنَهُمَا صَاحِبَ صَنْعَاءَ، وَصَاحِبَ الْيَمَامَةِ». [رواه البخاري: ٤٣٧٥]

**1680.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bir dəfə) yuxumda mənə dünya xəzinələri verildiyini, üstəlik qoluma qızıldan iki bilərzik taxıl-

[1] 227-ci hədisin qeydlərinə bax.

dığını gördüm və bunları (geymək) mənə ağır gəldi.[1] Sonra mənə: "Onlara üfür!" deyə vəhy edildi. Mən bilərziklərə üfürdükdə onlar yox oldular. Mən bu bilərzikləri aralarında olduğum[2] iki yalançının – Səna[3] və Yəmamə böyüklərinin[4] meydana gələcəyinə yozdum." (əl-Buxari, 4375)

## ٤٢– باب: قِصَّةُ أَهْلِ نَجْرَانَ

## 42-ci fəsil. Nəcranlıların[5] hekayəsi

١٦٨١ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: جَاءَ الْعَاقِبُ وَالسَّيِّدُ صَاحِبَا نَجْرَانَ إِلَى رَسُولِ اللَّهِ ﷺ يُرِيدَانِ أَنْ يُلاَعِنَاهُ، قَالَ فَقَالَ أَحَدُهُمَا لِصَاحِبِهِ لاَ تَفْعَلْ، فَوَاللَّهِ لَئِنْ كَانَ نَبِيًّا فَلاَعَنَّا، لاَ نُفْلِحُ نَحْنُ وَلاَ عَقِبُنَا مِنْ بَعْدِنَا. قَالاَ إِنَّا نُعْطِيكَ مَا سَأَلْتَنَا، وَابْعَثْ مَعَنَا رَجُلاً أَمِينًا، وَلاَ تَبْعَثْ مَعَنَا إِلاَّ أَمِينًا. فَقَالَ: «لأَبْعَثَنَّ مَعَكُمْ رَجُلاً أَمِينًا حَقَّ أَمِينٍ». فَاسْتَشْرَفَ لَهُ أَصْحَابُ رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: «قُمْ يَا أَبَا عُبَيْدَةَ بْنَ الْجَرَّاحِ». فَلَمَّا قَامَ قَالَ رَسُولُ اللَّهِ ﷺ: «هَذَا أَمِينُ هَذِهِ الأُمَّةِ». [رواه البخاري: ٤٣٨٠]

**1681.** Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: "(Bir dəfə) Nəcran əhlinin böyüklərindən olan Aqib və Seyyid Peyğəmbərin ﷺ yanına gedib (İsanın ﷺ peyğəmbər deyil, Allahın oğlu olduğunu sübuta yetirmək üçün əvvəlcə and içib sonra da yalançılara) lənət diləmək istədikdə, onlardan biri digərinə dedi: "(Belə) etmə! Vallahi, əgər o peyğəmbərdirsə, bu lənətdən sonra nə biz, nə də sonrakı nəslimiz nicat tapacaq." (Sonra onlar Peyğəmbərin ﷺ yanına gəlib) dedilər: "Bizdən nə (qədər cizyə) istəsən, sənə istədiyini verəcəyik. Amma gərək bizimlə etibarlı adam göndərəsən. Bax ha, ancaq etibarlı adam olsun." Peyğəmbər ﷺ buyurdu: "Mən sizinlə həqiqətən də ən etibarlı olan bir adam göndərəcəyəm." Onda Peyğəmbərin ﷺ əshabələrindən hər biri bu işin ona tapşırılmasını təmənna etdi. Peyğəmbər ﷺ dedi: "Qalx, ey Əbu Ubeydə ibn Cərrah!" Əbu Ubeydə ayağa qalxdıqda Peyğəmbər ﷺ buyurdu: "Bu (kişi) bu ümmətin ən etibarlı adamıdır." (əl-Buxari, 4380)

١٦٨٢ – عَنْ أَنَسٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «لِكُلِّ أُمَّةٍ أَمِينٌ، وَأَمِينُ هَذِهِ الأُمَّةِ أَبُو عُبَيْدَةَ بْنُ الْجَرَّاحِ». [رواه البخاري: ٤٣٨٢]

**1682.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər bir ümmətin içində ən etibarlı bir adam vardır. Bu ümmətin ən etibarlı adamı isə Əbu Ubeydə ibn Cərrahdır." (əl-Buxari, 4382)

## ٤٣– باب: قُدُومُ الأَشْعَرِيِّينَ وَأَهْلِ الْيَمَنِ

## 43-cü fəsil. Əşari qəbiləsindən olanların və (digər) yəmənlilərin (Peyğəmbərin ﷺ yanına) gəlməsi

١٦٨٣ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: أَتَيْنَا النَّبِيَّ ﷺ نَفَرٌ مِنَ الأَشْعَرِيِّينَ، فَاسْتَحْمَلْنَاهُ فَأَبَى أَنْ يَحْمِلَنَا فَاسْتَحْمَلْنَاهُ، فَحَلَفَ أَنْ لاَ يَحْمِلَنَا، ثُمَّ لَمْ يَلْبَثِ النَّبِيُّ ﷺ أَنْ أُتِيَ بِنَهْبِ إِبِلٍ، فَأَمَرَ لَنَا بِخَمْسِ ذَوْدٍ، فَلَمَّا قَبَضْنَاهَا قُلْنَا تَغَفَّلْنَا النَّبِيَّ ﷺ

---

[1] Kişiyə qızıl taxmaq qadağan olunduğuna görə Peyğəmbər ﷺ belə demişdir.
[2] Burada "aralarında" deyildikdə, ya Yəmamə ilə Yəmən arasında yerləşən Mədinə şəhəri, ya da bu iki yalançıdan birinin Peyğəmbərdən ﷺ əvvəl, digərinin isə sonra vəfat edəcəyi qəsd edilir.
[3] Yəməndə şəhər.
[4] Söhbət Əsvəd əl-Ənsidən və Müseyləmədən gedir.
[5] O dövrdə Yəmən sərhədinin yaxınlığında yaşamış xristianlar.

يَمِينَهُ، لاَ نُفْلِحُ بَعْدَهَا أَبَدًا فَأَتَيْتُهُ فَقُلْتُ: يَا رَسُولَ اللَّهِ إِنَّكَ حَلَفْتَ أَنْ لاَ تَحْمِلَنَا وَقَدْ حَمَلْتَنَا؟ قَالَ: «أَجَلْ، وَلَكِنْ لاَ أَحْلِفُ عَلَى يَمِينٍ فَأَرَى غَيْرَهَا خَيْرًا مِنْهَا إِلاَّ أَتَيْتُ الَّذِى هُوَ خَيْرٌ مِنْهَا». [رواه البخاري: ٤٣٨٥]

**1683.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "(Bir dəfə) biz bir dəstə əşari Peyğəmbərin ﷺ yanına gəlib ondan minik heyvanı istədik, lakin o, bizə heç nə vermədi. Biz bir daha ona müraciət etdik, o isə bizə minik heyvanı verməyəcəyinə and içdi. Çox keçmədən Peyğəmbərə ﷺ (qənimət olaraq) ələ keçirilmiş dəvələr gətirdilər və o, bizə beş dəvə verilməsini əmr etdi. Biz dəvələri götürdükdən sonra dedik: "Bizim ucbatımızdan Peyğəmbər ﷺ andını unutdu, (belə çıxır ki,) bundan sonra biz heç vaxt nicat tapmayacağıq." Onda mən Peyğəmbərin ﷺ yanına gəlib dedim: "Ya Rəsulullah, axı, sən bizə minik heyvanı verməyəcəyinə and içmişdin, lakin sonra bunları bizə verdin?" Peyğəmbər ﷺ dedi: "Elədir, lakin mən nəyəsə and içib sonra başqa bir qərarın daha xeyirli olduğunu görəndə, daha xeyirli olanı yerinə yetirirəm." (əl-Buxari, 4385)

١٦٨٤ – عَنْ أَبِى هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «أَتَاكُمْ أَهْلُ الْيَمَنِ، هُمْ أَرَقُّ أَفْئِدَةً وَأَلْيَنُ قُلُوبًا، الإِيمَانُ يَمَانٍ وَالْحِكْمَةُ يَمَانِيَةٌ، وَالْفَخْرُ وَالْخُيَلاَءُ فِى أَصْحَابِ الإِبِلِ، وَالسَّكِينَةُ وَالْوَقَارُ فِى أَهْلِ الْغَنَمِ». [رواه البخاري: ٤٣٨٨]

**1684.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizin yanınıza Yəmən əhli gəlib. Onlar ən incə ürəkli, ən yumşaq qəlbli (insanlardır). İman Yəməndədir[1], hikmət Yəməndədir. Lovğalıq və təkəbbürlük (adətən) dəvə sürüsünə sahib olan kimsələrdə özünü büruzə verir. Qoyun sürüsünə sahib olan kimsələr isə vüqarlı və dinc adam olurlar." (əl-Buxari, 4388)

## 44-cü fəsil. Vida həcci

## ٤٤ – باب: حَجَّةُ الْوَدَاعِ

١٦٨٥ – عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ: أَقْبَلَ النَّبِيُّ ﷺ عَامَ الْفَتْحِ وَهُوَ مُرْدِفٌ أُسَامَةَ عَلَى الْقَصْوَاءِ. وَمَعَهُ بِلاَلٌ وَعُثْمَانُ بْنُ طَلْحَةَ حَتَّى أَنَاخَ عِنْدَ الْبَيْتِ، ثُمَّ قَالَ لِعُثْمَانَ: «ائْتِنَا بِالْمِفْتَاحِ»، فَجَاءَهُ بِالْمِفْتَاحِ فَفَتَحَ لَهُ الْبَابَ، فَدَخَلَ النَّبِيُّ ﷺ وَأُسَامَةُ وَبِلاَلٌ وَعُثْمَانُ، ثُمَّ أَغْلَقُوا عَلَيْهِمِ الْبَابَ، فَمَكَثَ نَهَارًا طَوِيلاً ثُمَّ خَرَجَ، وَابْتَدَرَ النَّاسُ الدُّخُولَ، فَسَبَقْتُهُمْ فَوَجَدْتُ بِلاَلاً قَائِمًا مِنْ وَرَاءِ الْبَابِ فَقُلْتُ لَهُ أَيْنَ صَلَّى رَسُولُ اللَّهِ ﷺ فَقَالَ صَلَّى بَيْنَ ذَيْنِكَ الْعَمُودَيْنِ الْمُقَدَّمَيْنِ. وَكَانَ الْبَيْتُ عَلَى سِتَّةِ أَعْمِدَةٍ سَطْرَيْنِ، صَلَّى بَيْنَ الْعَمُودَيْنِ مِنَ السَّطْرِ الْمُقَدَّمِ، وَجَعَلَ بَابَ الْبَيْتِ خَلْفَ ظَهْرِهِ، وَاسْتَقْبَلَ بِوَجْهِهِ الَّذِى يَسْتَقْبِلُكَ حِينَ تَلِجُ الْبَيْتَ بَيْنَهُ وَبَيْنَ الْجِدَارِ، قَالَ وَنَسِيتُ أَنْ أَسْأَلَهُ كَمْ صَلَّى وَعِنْدَ الْمَكَانِ الَّذِى صَلَّى فِيهِ مَرْمَرَةٌ حَمْرَاءُ. [رواه البخاري: ٤٤٠٠]

**1685.** Rəvayət edir ki, ibn Ömər ﷺ demişdir: "(Məkkənin) fəth olunduğu il Peyğəmbər ﷺ Qəsva adlı dəvəsinin üstündə (şəhərə) daxil olduqda Usamə onun tərkində idi, Bilal və Osman ibn Təlhə isə onun yanında piyada gəlirdilər. Nəhayət, Peyğəmbər ﷺ Kəbəyə yaxınlaşıb dəvəsini yerə çökdürdü və Osmana: "Açarı bizə gətir!"– dedi. Osman açarı ona gətirdi və o, Kəbənin qapısını açdı. Peyğəmbər ﷺ, Üsamə, Bilal və Osman (Kəbəyə) daxil olduqdan sonra qapıları bağladılar. Peyğəmbər ﷺ bir müddət orada qaldıqdan sonra (bayıra)

[1] Peyğəmbər ﷺ demək istəmişdir ki, yəmənlilər başqalarına nisbətdə daha tez imana gəlirlər.

çıxdı. Bundan sonra camaat (Kəbəyə) doluşdu. Mən hamıdan qabaq içəri girib Bilalın qapının arxasında durduğunu gördüm və ondan: “Peyğəmbər ﷺ harada namaz qıldı?”– deyə soruşdum. Dedi: “O, qarşıdakı iki sütunun arasında namaz qıldı.” O vaxt Kəbə iki cərgəyə düzülmüş altı sütun üzərində tikilmişdi. Sonra Bilal ؓ dedi: “Peyğəmbər ﷺ qarşıdakı iki sütunun arasında namaz qıldı. Bu əsnada (Kəbənin) qapısı onun arxasında qaldı, üzünü də sənin üz tutduğun istiqamətə, (yəni) Kəbəyə daxil olduqda (yönəldiyin tərəfə) tutmuşdu. Onunla divar arasında (isə üç arşın məsafə var idi).”

(İbn Ömər) dedi: “Ondan Peyğəmbərin ﷺ neçə rükət namaz qıldığını soruşmaq yadımdan çıxdı. Peyğəmbər ﷺ namaz qıldığı yerdə qırmızı mərmər var idi.” (əl-Buxari, 4400)

١٦٨٦ – عَنْ زَيْدِ بْنِ أَرْقَمَ ؓ أَنَّ النَّبِيَّ ﷺ غَزَا تِسْعَ عَشْرَةَ غَزْوَةً، وَأَنَّهُ حَجَّ بَعْدَ مَا هَاجَرَ حَجَّةً وَاحِدَةً لَمْ يَحُجَّ بَعْدَهَا حَجَّةَ الْوَدَاعِ. [رواه البخاري: ٤٤٠٤]

**1686.** Zeyd ibn Ərqam ؓ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ on doqquz döyüşdə iştirak etmişdir, o, (Mədinəyə) hicrət etdikdən sonra bir dəfə həcc ziyarətində olmuş və bundan sonra bir daha həcc ziyarətinə getməmişdir. Bu da vida həcci olmuşdur.” (əl-Buxari, 4404)

١٦٨٧ – عَنْ أَبِي بَكْرَةَ ؓ عَنِ النَّبِيِّ ﷺ قَالَ: «الزَّمَانُ قَدِ اسْتَدَارَ كَهَيْئَةِ يَوْمَ خَلَقَ السَّمَوَاتِ وَالأَرْضَ، السَّنَةُ اثْنَا عَشَرَ شَهْرًا مِنْهَا أَرْبَعَةٌ حُرُمٌ ثَلاَثَةٌ مُتَوَالِيَاتٌ ذُو الْقَعْدَةِ وَذُو الْحِجَّةِ وَالْمُحَرَّمُ، وَرَجَبُ مُضَرَ الَّذِي بَيْنَ جُمَادَى وَشَعْبَانَ، أَيُّ شَهْرٍ هَذَا» قُلْنَا اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. فَسَكَتَ حَتَّى ظَنَنَّا أَنَّهُ سَيُسَمِّيهِ بِغَيْرِ اسْمِهِ. قَالَ: «أَلَيْسَ ذُو الْحِجَّةِ؟» قُلْنَا بَلَى. قَالَ: «فَأَيُّ بَلَدٍ هَذَا؟» قُلْنَا اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ، فَسَكَتَ حَتَّى ظَنَنَّا أَنَّهُ سَيُسَمِّيهِ بِغَيْرِ اسْمِهِ. قَالَ: «أَلَيْسَ الْبَلْدَةَ؟» قُلْنَا بَلَى. قَالَ «فَأَيُّ يَوْمٍ هَذَا؟» قُلْنَا اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ، فَسَكَتَ حَتَّى ظَنَنَّا أَنَّهُ سَيُسَمِّيهِ بِغَيْرِ اسْمِهِ. قَالَ: «أَلَيْسَ يَوْمَ النَّحْرِ». قُلْنَا بَلَى. قَالَ: «فَإِنَّ دِمَاءَكُمْ وَأَمْوَالَكُمْ – قَالَ مُحَمَّدٌ وَأَحْسِبُهُ قَالَ وَأَعْرَاضَكُمْ – عَلَيْكُمْ حَرَامٌ كَحُرْمَةِ يَوْمِكُمْ هَذَا، فِي بَلَدِكُمْ هَذَا، فِي شَهْرِكُمْ هَذَا وَسَتَلْقَوْنَ رَبَّكُمْ، فَسَيَسْأَلُكُمْ عَنْ أَعْمَالِكُمْ، أَلاَ فَلاَ تَرْجِعُوا بَعْدِي ضُلاَّلاً، يَضْرِبُ بَعْضُكُمْ رِقَابَ بَعْضٍ، أَلاَ لِيُبَلِّغِ الشَّاهِدُ الْغَائِبَ، فَلَعَلَّ بَعْضَ مَنْ يُبَلَّغُهُ أَنْ يَكُونَ أَوْعَى لَهُ مِنْ بَعْضِ مَنْ سَمِعَهُ، ثُمَّ قَالَ: أَلاَ هَلْ بَلَّغْتُ. مَرَّتَيْنِ». [رواه البخاري: ٤٤٠٦]

**1687.** Əbu Bəkrə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Zaman, Allah yerləri və göyü yaratdığı gündən bəri heç dəyişmədən dövran etməkdədir. İl on iki aydan ibarətdir. Bunlardan dördü haram aylardır. (Haram aylardan) üçü – zülqədə, zülhiccə və muhərrəm dalbadal gəlir. (Dördüncüsü isə) Mudər qəbiləsinin (digər on bir aydan üstün tutduğu) və cümadəl-Axir ilə Şaban (ayları) arasında keçən rəcəb ayıdır.” Sonra Peyğəmbər ﷺ soruşdu: “İndi hansı aydır?” Dedik: “Allah və Onun rəsulu daha yaxşı bilir.” Peyğəmbər ﷺ bir qədər susdu, hətta biz elə zənn etdik ki, o bu ayı başqa adla adlandıracaq. O dedi: “Məgər zülhiccə ayı deyilmi?!” Biz: “Bəli”– deyə cavab verdik. Sonra soruşdu: “Bura hansı şəhərdir?” Dedik: “Allah və Onun rəsulu daha yaxşı bilir.” Peyğəmbər ﷺ bir qədər susdu, hətta biz elə güman etdik ki, o bu şəhəri başqa adla adlandıracaq. O dedi: “Məgər (müqəddəs) şəhər deyilmi?!” Biz: “Bəli”– deyə cavab verdik. (Yenə) soruşdu: “Bu (gün) hansı gündür?” Dedik: “Allah və Onun rəsulu daha yaxşı bilir.” Peyğəmbər ﷺ bir qədər sus-

du, hətta biz elə zənn etdik ki, o bu günü başqa adla adlandıracaq. O dedi: "Məgər qurban günü deyilmi?!" Biz: "Bəli"– deyə cavab verdik. Onda o buyurdu: "Şübhəsiz ki, qanınız da, malınız da[1] sizə bu şəhərinizdə və bu ayınızda bu gününüzün haram olduğu kimi haramdır[2]. Siz tezliklə Rəbbinizin hüzurunda duracaqsınız. O sizdən əməlləriniz barədə soruşacaq. Diqqət edin! Məndən sonra azğınlığa düşüb bir-birinizin boynunu vurmayın! Qoy burada olanlar (eşitdiklərini) aramızda olmayanlara təbliğ etsinlər. Ola bilər ki, özlərinə təbliğ olunacaq kimsələrin bəzisi, (mənim dediklərimi öz qulağı ilə) eşidənlərin bəzisindən daha yaxşı qavrasın." Sonra Peyğəmbər ﷺ iki dəfə: "(Bu dini sizə) təbliğ etdimmi?"– dedi." (əl-Buxari, 4406)

١٦٨٨ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ حَلَقَ فِى حَجَّةِ الْوَدَاعِ وَأُنَاسٌ مِنْ أَصْحَابِهِ وَقَصَّرَ بَعْضُهُمْ. [رواه البخاري: ٤٤١١]

**1688.** İbn Ömər رضي الله عنهما rəvayət etmişdir ki, vida həccində Peyğəmbər ﷺ və onun əshabələrinin bir çoxu başını qırxdırmış, onların bəzisi də saçlarını qısaltmışdılar. (əl-Buxari, 4411)

## 45-ci fəsil. Təbuk döyüşü, (yaxud) çətin şəraitdə aparılan döyüş[3]

## ٤٥– باب: غَزْوَةُ تَبُوكَ، وَهِىَ غَزْوَةُ الْعُسْرَةِ

١٦٨٩ – عَنْ أَبِى مُوسَى رضي الله عنه قَالَ: أَرْسَلَنِى أَصْحَابِى إِلَى رَسُولِ اللَّهِ ﷺ أَسْأَلُهُ الْحُمْلاَنَ لَهُمْ، إِذْ هُمْ مَعَهُ فِى جَيْشِ الْعُسْرَةِ وَهِىَ غَزْوَةُ تَبُوكَ فَقُلْتُ يَا نَبِىَّ اللَّهِ، إِنَّ أَصْحَابِى أَرْسَلُونِى إِلَيْكَ لِتَحْمِلَهُمْ. فَقَالَ: «وَاللَّهِ لاَ أَحْمِلُكُمْ عَلَى شَىْءٍ». وَوَافَقْتُهُ، وَهُوَ غَضْبَانُ وَلاَ أَشْعُرُ، وَرَجَعْتُ حَزِينًا مِنْ مَنْعِ النَّبِىِّ ﷺ، وَمِنْ مَخَافَةِ أَنْ يَكُونَ النَّبِىُّ ﷺ وَجَدَ فِى نَفْسِهِ عَلَىَّ، فَرَجَعْتُ إِلَى أَصْحَابِى فَأَخْبَرْتُهُمُ الَّذِى قَالَ النَّبِىُّ ﷺ، فَلَمْ أَلْبَثْ إِلاَّ سُوَيْعَةً إِذْ سَمِعْتُ بِلاَلاً يُنَادِى أَىْ عَبْدَ اللَّهِ بْنَ قَيْسٍ. فَأَجَبْتُهُ، فَقَالَ أَجِبْ رَسُولَ اللَّهِ ﷺ يَدْعُوكَ، فَلَمَّا أَتَيْتُهُ، قَالَ: «خُذْ هَذَيْنِ الْقَرِينَيْنِ – وَهَذَيْنِ الْقَرِينَيْنِ لِسِتَّةِ أَبْعِرَةٍ ابْتَاعَهُنَّ حِينَئِذٍ مِنْ سَعْدٍ – فَانْطَلِقْ بِهِنَّ إِلَى أَصْحَابِكَ فَقُلْ إِنَّ اللَّهَ – أَوْ قَالَ إِنَّ رَسُولَ اللَّهِ ﷺ يَحْمِلُكُمْ عَلَى هَؤُلاَءِ فَارْكَبُوهُنَّ». فَانْطَلَقْتُ إِلَيْهِمْ بِهِنَّ، فَقُلْتُ إِنَّ النَّبِىَّ ﷺ يَحْمِلُكُمْ عَلَى هَؤُلاَءِ وَلَكِنِّى وَاللَّهِ لاَ أَدَعُكُمْ حَتَّى يَنْطَلِقَ مَعِى بَعْضُكُمْ إِلَى مَنْ سَمِعَ مَقَالَةَ رَسُولِ اللَّهِ ﷺ لاَ تَظُنُّوا أَنِّى حَدَّثْتُكُمْ شَيْئًا لَمْ يَقُلْهُ رَسُولُ اللَّهِ ﷺ فَقَالُوا لِى إِنَّكَ عِنْدَنَا لَمُصَدَّقٌ، وَلَنَفْعَلَنَّ مَا أَحْبَبْتَ. فَانْطَلَقَ أَبُو مُوسَى بِنَفَرٍ مِنْهُمْ حَتَّى أَتَوُا الَّذِينَ سَمِعُوا قَوْلَ رَسُولِ اللَّهِ ﷺ مَنْعَهُ إِيَّاهُمْ، ثُمَّ إِعْطَاءَهُمْ بَعْدُ، فَحَدَّثُوهُمْ بِمِثْلِ مَا حَدَّثَهُمْ بِهِ أَبُو مُوسَى. [رواه البخاري: ٤٤١٥]

**1689.** Rəvayət edilir ki, Əbu Musa رضي الله عنه demişdir: "(Bir dəfə) dostlarım Peyğəmbərdən ﷺ minik heyvanı istəmək üçün məni onun yanına göndərdilər. O vaxt onlar Usra ordusunun tərkibində Təbuk döyüşünə qatılmaq istəyirdilər. Mən (Peyğəmbərin ﷺ yanına gəlib) dedim: "Ey Allahın peyğəmbəri, dostlarım məni sənin yanına göndərdilər ki, onlara minik heyvanı verəsən." Peyğəmbər ﷺ dedi: "Vallahi, mən sizə heç bir minik verən deyiləm." Mən özüm də bilmədən Peyğəmbərin ﷺ yanına onun qəzəbli olduğu vaxt gəlmişdim.

[1] Hədisin ravisi Muhəmməd dedi: "Deyəsən, o həm də: "namusunuz da..."- demişdir.
[2] Yəni toxunulmazdır.
[3] Ərəbcə buna "Usra" döyüşü də deyilir.

Peyğəmbərin ﷺ yox cavabı (mənə çox pis təsir etdi,) üstəlik mənə qəzəbi tutacağından qorxdum və məyus halda geri döndüm. Mən dostlarımın yanına gəlib Peyğəmbərin ﷺ dediyini onlara xəbər verdim. Az keçmədən Bilalın: "Ey Abdullah ibn Qeys!"– deyə (məni) çağırdığını eşitdim. Mən ona hay verdikdə dedi: "Peyğəmbərin ﷺ yanına get, o səni çağırır." Mən Peyğəmbərin ﷺ yanına gəldikdə o buyurdu: "Bu bir-birilərinə cüt-cüt kəndirlənmiş dəvələri (Səddən satın aldığı altı dəvəni) götür, apar dostlarının yanına və de ki: "Allah (və ya Allahın elçisi ﷺ) bu heyvanları sizə verir, onlara minə bilərsiniz." Mən heyvanları götürüb dostlarımın yanına getdim və dedim: "Allahın elçisi ﷺ bu heyvanları sizə verdi, lakin Allaha and olsun ki, biriniz mənimlə Peyğəmbərin ﷺ sözünü eşidən adamların yanına getməyincə mən sizdən əl çəkməyəcəyəm. Belə etməlisiniz ki, mənim Peyğəmbərin ﷺ demədiyi bir sözü danışdığımı zənn etməyəsiniz." Onlar mənə dedilər: "Onsuz da biz sənə inanırıq. (Amma bununla yanaşı) sənin istəyini də mütləq yerinə yetirəcəyik."

Əbu Musa onlardan bir neçə nəfər götürüb getdi. Nəhayət, Peyğəmbərin ﷺ əvvəlcə onlara imtina etdiyini, sonra isə istədiklərini onlara verməyə razılaşdığını eşidən adamların yanına gəlib çatdılar və bu adamlar onlara Əbu Musanın dediklərini olduğu kimi xəbər verdilər." (əl-Buxari, 4415)

١٦٩٠ – عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ خَرَجَ إِلَى تَبُوكَ، وَاسْتَخْلَفَ عَلِيًّا فَقَالَ أَتُخَلِّفُنِى فِى الصِّبْيَانِ وَالنِّسَاءِ قَالَ: «أَلاَ تَرْضَى أَنْ تَكُونَ مِنِّى بِمَنْزِلَةِ هَارُونَ مِنْ مُوسَى إِلاَّ أَنَّهُ لَيْسَ نَبِىٌّ بَعْدِى». [رواه البخاري: ٤٤١٦]

**1690.** Səd ibn Əbu Vəqqas ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ Təbuka yola düşərkən Əlini öz yerinə başçı təyin etdi. Onda Əli dedi: "Doğrudanmı sən məni uşaqların və qadınların yanında qoyub getmək istəyirsən?!" Peyğəmbər ﷺ buyurdu: "İstəmirsən ki, Harun Musaya yaxın olduğu kimi, sən də mənə yaxın olasan?! Fəqət məndən sonra peyğəmbər gəlməyəcək." (əl-Buxari, 4416)

## ٤٦– باب: حَدِيثُ كَعْبِ بْنِ مَالِكٍ ؓ ﴿وَعَلَى ٱلثَّلَـٰثَةِ ٱلَّذِينَ خُلِّفُواْ﴾

## 46-cı fəsil. Kəb ibn Malikin ؓ hədisi. Uca Allah buyurur: "Geri qalmış üç nəfəri də *bağışladı*"[1]

١٦٩١ – عَنْ كَعْبِ بْنِ مَالِكٍ ؓ قَالَ: لَمْ أَتَخَلَّفْ عَنْ رَسُولِ اللَّهِ ﷺ فِى غَزْوَةٍ غَزَاهَا إِلاَّ فِى غَزْوَةِ تَبُوكَ، غَيْرَ أَنِّى كُنْتُ تَخَلَّفْتُ فِى غَزْوَةِ بَدْرٍ، وَلَمْ يُعَاتِبْ أَحَدًا تَخَلَّفَ، عَنْهَا إِنَّمَا خَرَجَ رَسُولُ اللَّهِ ﷺ يُرِيدُ عِيرَ قُرَيْشٍ، حَتَّى جَمَعَ اللَّهُ بَيْنَهُمْ وَبَيْنَ عَدُوِّهِمْ عَلَى غَيْرِ مِيعَادٍ وَلَقَدْ شَهِدْتُ مَعَ رَسُولِ اللَّهِ ﷺ لَيْلَةَ الْعَقَبَةِ حِينَ تَوَاثَقْنَا عَلَى الإِسْلاَمِ، وَمَا أُحِبُّ أَنَّ لِى بِهَا مَشْهَدَ بَدْرٍ، وَإِنْ كَانَتْ بَدْرٌ أَذْكَرَ فِى النَّاسِ مِنْهَا، كَانَ مِنْ خَبَرِى أَنِّى لَمْ أَكُنْ قَطُّ أَقْوَى وَلاَ أَيْسَرَ حِينَ تَخَلَّفْتُ عَنْهُ فِى تِلْكَ الْغَزْوَةِ، وَاللَّهِ مَا اجْتَمَعَتْ عِنْدِى قَبْلَهُ رَاحِلَتَانِ قَطُّ حَتَّى جَمَعْتُهُمَا فِى تِلْكَ الْغَزْوَةِ، وَلَمْ يَكُنْ رَسُولُ اللَّهِ ﷺ يُرِيدُ غَزْوَةً إِلاَّ وَرَّى بِغَيْرِهَا، حَتَّى كَانَتْ تِلْكَ الْغَزْوَةُ، غَزَاهَا رَسُولُ اللَّهِ ﷺ فِى حَرٍّ شَدِيدٍ، وَاسْتَقْبَلَ سَفَرًا بَعِيدًا وَمَفَازًا وَعَدُوًّا كَثِيرًا، فَجَلَّى لِلْمُسْلِمِينَ أَمْرَهُمْ لِيَتَأَهَّبُوا أُهْبَةَ غَزْوِهِمْ، فَأَخْبَرَهُمْ بِوَجْهِهِ الَّذِى يُرِيدُ، وَالْمُسْلِمُونَ مَعَ رَسُولِ اللَّهِ ﷺ كَثِيرٌ، وَلاَ يَجْمَعُهُمْ كِتَابٌ حَافِظٌ – يُرِيدُ الدِّيوَانَ

[1] "ət-Tovbə" surəsi, 118.

– قَالَ كَعْبٌ فَمَا رَجُلٌ يُرِيدُ أَنْ يَتَغَيَّبَ إِلاَّ ظَنَّ أَنْ سَيَخْفَى لَهُ مَا لَمْ يَنْزِلْ فِيهِ وَحْىُ اللَّهِ، وَغَزَا رَسُولُ اللَّهِ ﷺ تِلْكَ الْغَزْوَةَ حِينَ طَابَتِ الثِّمَارُ وَالظِّلاَلُ، وَتَجَهَّزَ رَسُولُ اللَّهِ ﷺ وَالْمُسْلِمُونَ مَعَهُ، فَطَفِقْتُ أَغْدُو لِكَىْ أَتَجَهَّزَ مَعَهُمْ فَأَرْجِعُ وَلَمْ أَقْضِ شَيْئًا، فَأَقُولُ فِى نَفْسِى أَنَا قَادِرٌ عَلَيْهِ. فَلَمْ يَزَلْ يَتَمَادَى بِى حَتَّى اشْتَدَّ بِالنَّاسِ الْجِدُّ، فَأَصْبَحَ رَسُولُ اللَّهِ ﷺ وَالْمُسْلِمُونَ مَعَهُ وَلَمْ أَقْضِ مِنْ جَهَازِى شَيْئًا، فَقُلْتُ أَتَجَهَّزُ بَعْدَهُ بِيَوْمٍ أَوْ يَوْمَيْنِ ثُمَّ أَلْحَقُهُمْ، فَغَدَوْتُ بَعْدَ أَنْ فَصَلُوا لأَتَجَهَّزَ، فَرَجَعْتُ وَلَمْ أَقْضِ شَيْئًا، ثُمَّ غَدَوْتُ ثُمَّ رَجَعْتُ وَلَمْ أَقْضِ شَيْئًا، فَلَمْ يَزَلْ بِى حَتَّى أَسْرَعُوا وَتَفَارَطَ الْغَزْوُ، وَهَمَمْتُ أَنْ أَرْتَحِلَ فَأُدْرِكَهُمْ، وَلَيْتَنِى فَعَلْتُ، فَلَمْ يُقَدَّرْ لِى ذَلِكَ، فَكُنْتُ إِذَا خَرَجْتُ فِى النَّاسِ بَعْدَ خُرُوجِ رَسُولِ اللَّهِ ﷺ فَطُفْتُ فِيهِمْ، أَحْزَنَنِى أَنِّى لاَ أَرَى إِلاَّ رَجُلاً مَغْمُوصًا عَلَيْهِ النِّفَاقُ أَوْ رَجُلاً مِمَّنْ عَذَرَ اللَّهُ مِنَ الضُّعَفَاءِ، وَلَمْ يَذْكُرْنِى رَسُولُ اللَّهِ ﷺ حَتَّى بَلَغَ تَبُوكَ، فَقَالَ وَهُوَ جَالِسٌ فِى الْقَوْمِ بِتَبُوكَ: «مَا فَعَلَ كَعْبٌ». فَقَالَ رَجُلٌ مِنْ بَنِى سَلِمَةَ يَا رَسُولَ اللَّهِ، حَبَسَهُ بُرْدَاهُ وَنَظَرُهُ فِى عِطْفِهِ. فَقَالَ مُعَاذُ بْنُ جَبَلٍ بِئْسَ مَا قُلْتَ، وَاللَّهِ يَا رَسُولَ اللَّهِ، مَا عَلِمْنَا عَلَيْهِ إِلاَّ خَيْرًا. فَسَكَتَ رَسُولُ اللَّهِ ﷺ. قَالَ كَعْبُ بْنُ مَالِكٍ فَلَمَّا بَلَغَنِى أَنَّهُ تَوَجَّهَ قَافِلاً حَضَرَنِى هَمِّى، وَطَفِقْتُ أَتَذَكَّرُ الْكَذِبَ وَأَقُولُ بِمَاذَا أَخْرُجُ مِنْ سَخَطِهِ غَدًا وَاسْتَعَنْتُ عَلَى ذَلِكَ بِكُلِّ ذِى رَأْىٍ مِنْ أَهْلِى، فَلَمَّا قِيلَ إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَدْ أَظَلَّ قَادِمًا زَاحَ عَنِّى الْبَاطِلُ، وَعَرَفْتُ أَنِّى لَنْ أَخْرُجَ مِنْهُ أَبَدًا بِشَىْءٍ فِيهِ كَذِبٌ، فَأَجْمَعْتُ صِدْقَهُ، وَأَصْبَحَ رَسُولُ اللَّهِ ﷺ قَادِمًا، وَكَانَ إِذَا قَدِمَ مِنْ سَفَرٍ بَدَأَ بِالْمَسْجِدِ فَيَرْكَعُ فِيهِ رَكْعَتَيْنِ ثُمَّ جَلَسَ لِلنَّاسِ، فَلَمَّا فَعَلَ ذَلِكَ جَاءَهُ الْمُخَلَّفُونَ، فَطَفِقُوا يَعْتَذِرُونَ إِلَيْهِ، وَيَحْلِفُونَ لَهُ، وَكَانُوا بِضْعَةً وَثَمَانِينَ رَجُلاً فَقَبِلَ مِنْهُمْ رَسُولُ اللَّهِ ﷺ عَلاَنِيَتَهُمْ، وَبَايَعَهُمْ وَاسْتَغْفَرَ لَهُمْ، وَوَكَلَ سَرَائِرَهُمْ إِلَى اللَّهِ، فَجِئْتُهُ فَلَمَّا سَلَّمْتُ عَلَيْهِ تَبَسَّمَ تَبَسُّمَ الْمُغْضَبِ، ثُمَّ قَالَ: «تَعَالَ». فَجِئْتُ أَمْشِى حَتَّى جَلَسْتُ بَيْنَ يَدَيْهِ، فَقَالَ لِى: «مَا خَلَّفَكَ أَلَمْ تَكُنْ قَدِ ابْتَعْتَ ظَهْرَكَ». فَقُلْتُ بَلَى، إِنِّى وَاللَّهِ لَوْ جَلَسْتُ عِنْدَ غَيْرِكَ مِنْ أَهْلِ الدُّنْيَا، لَرَأَيْتُ أَنْ سَأَخْرُجُ مِنْ سَخَطِهِ بِعُذْرٍ، وَلَقَدْ أُعْطِيتُ جَدَلاً، وَلَكِنِّى وَاللَّهِ لَقَدْ عَلِمْتُ لَئِنْ حَدَّثْتُكَ الْيَوْمَ حَدِيثَ كَذِبٍ تَرْضَى بِهِ عَنِّى لَيُوشِكَنَّ اللَّهُ أَنْ يُسْخِطَكَ عَلَىَّ، وَلَئِنْ حَدَّثْتُكَ حَدِيثَ صِدْقٍ تَجِدُ عَلَىَّ فِيهِ إِنِّى لأَرْجُو فِيهِ عَفْوَ اللَّهِ، لاَ وَاللَّهِ مَا كَانَ لِى مِنْ عُذْرٍ، وَاللَّهِ مَا كُنْتُ قَطُّ أَقْوَى وَلاَ أَيْسَرَ مِنِّى حِينَ تَخَلَّفْتُ عَنْكَ. فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَمَّا هَذَا فَقَدْ صَدَقَ، فَقُمْ حَتَّى يَقْضِىَ اللَّهُ فِيكَ». فَقُمْتُ وَثَارَ رِجَالٌ مِنْ بَنِى سَلِمَةَ فَاتَّبَعُونِى، فَقَالُوا لِى وَاللَّهِ مَا عَلِمْنَاكَ كُنْتَ أَذْنَبْتَ ذَنْبًا قَبْلَ هَذَا، وَلَقَدْ عَجَزْتَ أَنْ لاَ تَكُونَ اعْتَذَرْتَ إِلَى رَسُولِ اللَّهِ ﷺ بِمَا اعْتَذَرَ إِلَيْهِ الْمُتَخَلِّفُونَ، قَدْ كَانَ كَافِيَكَ ذَنْبَكَ اسْتِغْفَارُ رَسُولِ اللَّهِ ﷺ لَكَ، فَوَاللَّهِ مَا زَالُوا يُؤَنِّبُونِى حَتَّى أَرَدْتُ أَنْ أَرْجِعَ فَأُكَذِّبُ نَفْسِى، ثُمَّ قُلْتُ لَهُمْ هَلْ لَقِىَ هَذَا مَعِى أَحَدٌ قَالُوا نَعَمْ، رَجُلاَنِ قَالاَ مِثْلَ مَا قُلْتَ، فَقِيلَ لَهُمَا مِثْلُ مَا قِيلَ لَكَ. فَقُلْتُ مَنْ هُمَا قَالُوا مُرَارَةُ بْنُ الرَّبِيعِ الْعَمْرِىُّ وَهِلاَلُ بْنُ أُمَيَّةَ الْوَاقِفِىُّ. فَذَكَرُوا لِى رَجُلَيْنِ صَالِحَيْنِ قَدْ شَهِدَا بَدْرًا فِيهِمَا إِسْوَةٌ، فَمَضَيْتُ حِينَ ذَكَرُوهُمَا لِى، وَنَهَى رَسُولُ اللَّهِ ﷺ الْمُسْلِمِينَ عَنْ كَلاَمِنَا أَيُّهَا الثَّلاَثَةُ مِنْ بَيْنِ مَنْ تَخَلَّفَ عَنْهُ، فَاجْتَنَبَنَا النَّاسُ وَتَغَيَّرُوا لَنَا حَتَّى تَنَكَّرَتْ فِى نَفْسِى الأَرْضُ، فَمَا هِىَ الَّتِى أَعْرِفُ، فَلَبِثْنَا عَلَى ذَلِكَ خَمْسِينَ لَيْلَةً، فَأَمَّا صَاحِبَاىَ فَاسْتَكَانَا وَقَعَدَا فِى بُيُوتِهِمَا يَبْكِيَانِ، وَأَمَّا أَنَا فَكُنْتُ أَشَبَّ الْقَوْمِ وَأَجْلَدَهُمْ، فَكُنْتُ أَخْرُجُ فَأَشْهَدُ الصَّلاَةَ مَعَ الْمُسْلِمِينَ وَأَطُوفُ فِى الأَسْوَاقِ، وَلاَ يُكَلِّمُنِى أَحَدٌ، وَآتِى رَسُولَ اللَّهِ ﷺ فَأُسَلِّمُ عَلَيْهِ وَهُوَ فِى مَجْلِسِهِ بَعْدَ الصَّلاَةِ، فَأَقُولُ فِى نَفْسِى هَلْ حَرَّكَ شَفَتَيْهِ بِرَدِّ السَّلاَمِ عَلَىَّ أَمْ لاَ ثُمَّ أُصَلِّى قَرِيبًا مِنْهُ فَأُسَارِقُهُ النَّظَرَ، فَإِذَا أَقْبَلْتُ عَلَى صَلاَتِى أَقْبَلَ إِلَىَّ، وَإِذَا الْتَفَتُّ نَحْوَهُ أَعْرَضَ عَنِّى، حَتَّى إِذَا طَالَ عَلَىَّ ذَلِكَ مِنْ جَفْوَةِ النَّاسِ مَشَيْتُ حَتَّى تَسَوَّرْتُ جِدَارَ حَائِطِ أَبِى قَتَادَةَ وَهُوَ ابْنُ عَمِّى وَأَحَبُّ النَّاسِ إِلَىَّ، فَسَلَّمْتُ عَلَيْهِ، فَوَاللَّهِ مَا رَدَّ عَلَىَّ السَّلاَمَ، فَقُلْتُ يَا أَبَا قَتَادَةَ، أَنْشُدُكَ بِاللَّهِ هَلْ تَعْلَمُنِى أُحِبُّ اللَّهَ وَرَسُولَهُ فَسَكَتَ، فَعُدْتُ لَهُ فَنَشَدْتُهُ فَسَكَتَ، فَعُدْتُ لَهُ فَنَشَدْتُهُ. فَقَالَ اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ. فَفَاضَتْ عَيْنَاىَ وَتَوَلَّيْتُ حَتَّى تَسَوَّرْتُ الْجِدَارَ، قَالَ فَبَيْنَا أَنَا أَمْشِى بِسُوقِ الْمَدِينَةِ إِذَا نَبَطِىٌّ مِنْ

أَنْبَاط أَهْلِ الشَّأْمِ مِمَّنْ قَدِمَ بِالطَّعَامِ يَبِيعُهُ بِالْمَدِينَةِ يَقُولُ مَنْ يَدُلُّ عَلَى كَعْبِ بْنِ مَالِكٍ فَطَفِقَ النَّاسُ يُشِيرُونَ لَهُ، حَتَّى إِذَا جَاءَنِى دَفَعَ إِلَىَّ كِتَابًا مِنْ مَلِكِ غَسَّانَ، فَإِذَا فِيهِ أَمَّا بَعْدُ فَإِنَّهُ قَدْ بَلَغَنِى أَنَّ صَاحِبَكَ قَدْ جَفَاكَ، وَلَمْ يَجْعَلْكَ اللَّهُ بِدَارِ هَوَانٍ وَلاَ مَضْيَعَةٍ، فَالْحَقْ بِنَا نُوَاسِكَ. فَقُلْتُ لَمَّا قَرَأْتُهَا وَهَذَا أَيْضًا مِنَ الْبَلاَءِ. فَتَيَمَّمْتُ بِهَا التَّنُّورَ فَسَجَرْتُهُ بِهَا، حَتَّى إِذَا مَضَتْ أَرْبَعُونَ لَيْلَةً مِنَ الْخَمْسِينَ إِذَا رَسُولُ رَسُولِ اللَّهِ ﷺ يَأْتِينِى فَقَالَ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ يَأْمُرُكَ أَنْ تَعْتَزِلَ امْرَأَتَكَ فَقُلْتُ أُطَلِّقُهَا أَمْ مَاذَا أَفْعَلُ قَالَ لاَ بَلِ اعْتَزِلْهَا وَلاَ تَقْرَبْهَا. وَأَرْسَلَ إِلَى صَاحِبَىَّ مِثْلَ ذَلِكَ، فَقُلْتُ لاِمْرَأَتِى الْحَقِى بِأَهْلِكِ فَتَكُونِى عِنْدَهُمْ حَتَّى يَقْضِىَ اللَّهُ فِى هَذَا الأَمْرِ. قَالَ كَعْبٌ فَجَاءَتِ امْرَأَةُ هِلاَلِ بْنِ أُمَيَّةَ رَسُولَ اللَّهِ ﷺ فَقَالَتْ يَا رَسُولَ اللَّهِ، إِنَّ هِلاَلَ بْنَ أُمَيَّةَ شَيْخٌ ضَائِعٌ لَيْسَ لَهُ خَادِمٌ فَهَلْ تَكْرَهُ أَنْ أَخْدُمَهُ قَالَ: «لاَ وَلَكِنْ لاَ يَقْرَبْكِ». قَالَتْ إِنَّهُ وَاللَّهِ مَا بِهِ حَرَكَةٌ إِلَى شَىْءٍ، وَاللَّهِ مَا زَالَ يَبْكِى مُنْذُ كَانَ مِنْ أَمْرِهِ مَا كَانَ إِلَى يَوْمِهِ هَذَا. فَقَالَ لِى بَعْضُ أَهْلِى لَوِ اسْتَأْذَنْتَ رَسُولَ اللَّهِ ﷺ فِى امْرَأَتِكَ كَمَا أَذِنَ لاِمْرَأَةِ هِلاَلِ بْنِ أُمَيَّةَ أَنْ تَخْدُمَهُ فَقُلْتُ وَاللَّهِ لاَ أَسْتَأْذِنُ فِيهَا رَسُولَ اللَّهِ ﷺ وَمَا يُدْرِينِى مَا يَقُولُ رَسُولُ اللَّهِ ﷺ إِذَا اسْتَأْذَنْتُهُ فِيهَا وَأَنَا رَجُلٌ شَابٌّ فَلَبِثْتُ بَعْدَ ذَلِكَ عَشْرَ لَيَالٍ حَتَّى كَمَلَتْ لَنَا خَمْسُونَ لَيْلَةً مِنْ حِينِ نَهَى رَسُولُ اللَّهِ ﷺ عَنْ كَلاَمِنَا، فَلَمَّا صَلَّيْتُ صَلاَةَ الْفَجْرِ صُبْحَ خَمْسِينَ لَيْلَةً، وَأَنَا عَلَى ظَهْرِ بَيْتٍ مِنْ بُيُوتِنَا، فَبَيْنَا أَنَا جَالِسٌ عَلَى الْحَالِ الَّتِى ذَكَرَ اللَّهُ، قَدْ ضَاقَتْ عَلَىَّ نَفْسِى، وَضَاقَتْ عَلَىَّ الأَرْضُ بِمَا رَحُبَتْ، سَمِعْتُ صَوْتَ صَارِخٍ أَوْفَى عَلَى جَبَلِ سَلْعٍ بِأَعْلَى صَوْتِهِ يَا كَعْبُ بْنَ مَالِكٍ، أَبْشِرْ. قَالَ فَخَرَرْتُ سَاجِدًا، وَعَرَفْتُ أَنْ قَدْ جَاءَ فَرَجٌ، وَآذَنَ رَسُولُ اللَّهِ ﷺ بِتَوْبَةِ اللَّهِ عَلَيْنَا حِينَ صَلَّى صَلاَةَ الْفَجْرِ، فَذَهَبَ النَّاسُ يُبَشِّرُونَنَا، وَذَهَبَ قِبَلَ صَاحِبَىَّ مُبَشِّرُونَ، وَرَكَضَ إِلَىَّ رَجُلٌ فَرَسًا، وَسَعَى سَاعٍ مِنْ أَسْلَمَ فَأَوْفَى عَلَى الْجَبَلِ وَكَانَ الصَّوْتُ أَسْرَعَ مِنَ الْفَرَسِ، فَلَمَّا جَاءَنِى الَّذِى سَمِعْتُ صَوْتَهُ يُبَشِّرُنِى نَزَعْتُ لَهُ ثَوْبَىَّ، فَكَسَوْتُهُ إِيَّاهُمَا بِبُشْرَاهُ، وَاللَّهِ مَا أَمْلِكُ غَيْرَهُمَا يَوْمَئِذٍ، وَاسْتَعَرْتُ ثَوْبَيْنِ فَلَبِسْتُهُمَا، وَانْطَلَقْتُ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَيَتَلَقَّانِى النَّاسُ فَوْجًا فَوْجًا يُهَنُّونِى بِالتَّوْبَةِ، يَقُولُونَ لِتَهْنِكَ تَوْبَةُ اللَّهِ عَلَيْكَ. قَالَ كَعْبٌ حَتَّى دَخَلْتُ الْمَسْجِدَ، فَإِذَا رَسُولُ اللَّهِ ﷺ جَالِسٌ حَوْلَهُ النَّاسُ فَقَامَ إِلَىَّ طَلْحَةُ بْنُ عُبَيْدِ اللَّهِ يُهَرْوِلُ حَتَّى صَافَحَنِى وَهَنَّانِى، وَاللَّهِ مَا قَامَ إِلَىَّ رَجُلٌ مِنَ الْمُهَاجِرِينَ غَيْرَهُ، وَلاَ أَنْسَاهَا لِطَلْحَةَ، قَالَ كَعْبٌ فَلَمَّا سَلَّمْتُ عَلَى رَسُولِ اللَّهِ ﷺ قَالَ رَسُولُ اللَّهِ ﷺ وَهُوَ يَبْرُقُ وَجْهُهُ مِنَ السُّرُورِ: «أَبْشِرْ بِخَيْرِ يَوْمٍ مَرَّ عَلَيْكَ مُنْذُ وَلَدَتْكَ أُمُّكَ». قَالَ قُلْتُ أَمِنْ عِنْدِكَ يَا رَسُولَ اللَّهِ أَمْ مِنْ عِنْدِ اللَّهِ قَالَ: «لاَ، بَلْ مِنْ عِنْدِ اللَّهِ». وَكَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا سُرَّ اسْتَنَارَ وَجْهُهُ حَتَّى كَأَنَّهُ قِطْعَةُ قَمَرٍ، وَكُنَّا نَعْرِفُ ذَلِكَ مِنْهُ، فَلَمَّا جَلَسْتُ بَيْنَ يَدَيْهِ قُلْتُ يَا رَسُولَ اللَّهِ، إِنَّ مِنْ تَوْبَتِى أَنْ أَنْخَلِعَ مِنْ مَالِى صَدَقَةً إِلَى اللَّهِ وَإِلَى رَسُولِ اللَّهِ. قَالَ رَسُولُ اللَّهِ ﷺ: «أَمْسِكْ عَلَيْكَ بَعْضَ مَالِكَ فَهُوَ خَيْرٌ لَكَ». قُلْتُ فَإِنِّى أُمْسِكُ سَهْمِى الَّذِى بِخَيْبَرَ، فَقُلْتُ يَا رَسُولَ اللَّهِ، إِنَّ اللَّهَ إِنَّمَا نَجَّانِى بِالصِّدْقِ، وَإِنَّ مِنْ تَوْبَتِى أَنْ لاَ أُحَدِّثَ إِلاَّ صِدْقًا مَا بَقِيتُ، فَوَاللَّهِ مَا أَعْلَمُ أَحَدًا مِنَ الْمُسْلِمِينَ أَبْلاَهُ اللَّهُ فِى صِدْقِ الْحَدِيثِ مُنْذُ ذَكَرْتُ ذَلِكَ لِرَسُولِ اللَّهِ ﷺ أَحْسَنَ مِمَّا أَبْلاَنِى، مَا تَعَمَّدْتُ مُنْذُ ذَكَرْتُ ذَلِكَ لِرَسُولِ اللَّهِ ﷺ إِلَى يَوْمِى هَذَا كَذِبًا، وَإِنِّى لأَرْجُو أَنْ يَحْفَظَنِى اللَّهُ فِيمَا بَقِيتُ وَأَنْزَلَ اللَّهُ عَلَى رَسُولِهِ ﷺ: ﴿لَّقَد تَّابَ ٱللَّهُ عَلَى ٱلنَّبِيِّ وَٱلۡمُهَٰجِرِينَ﴾ إِلَى قَوْلِهِ: ﴿وَكُونُواْ مَعَ ٱلصَّٰدِقِينَ﴾ فَوَاللَّهِ مَا أَنْعَمَ اللَّهُ عَلَىَّ مِنْ نِعْمَةٍ قَطُّ بَعْدَ أَنْ هَدَانِى لِلإِسْلاَمِ أَعْظَمَ فِى نَفْسِى مِنْ صِدْقِى لِرَسُولِ اللَّهِ ﷺ أَنْ لاَ أَكُونَ كَذَبْتُهُ، فَأَهْلِكَ كَمَا هَلَكَ الَّذِينَ كَذَبُوا، فَإِنَّ اللَّهَ قَالَ لِلَّذِينَ كَذَبُوا حِينَ أَنْزَلَ الْوَحْىَ شَرَّ مَا قَالَ لأَحَدٍ، فَقَالَ تَبَارَكَ وَتَعَالَى: ﴿سَيَحۡلِفُونَ بِٱللَّهِ لَكُمۡ إِذَا ٱنقَلَبۡتُمۡ﴾ إِلَى قَوْلِهِ: ﴿فَإِنَّ ٱللَّهَ لَا يَرۡضَىٰ عَنِ ٱلۡقَوۡمِ ٱلۡفَٰسِقِينَ﴾. قَالَ كَعْبٌ وَكُنَّا تَخَلَّفْنَا أَيُّهَا الثَّلاَثَةُ عَنْ أَمْرِ أُولَئِكَ الَّذِينَ قَبِلَ مِنْهُمْ رَسُولُ اللَّهِ ﷺ حِينَ حَلَفُوا لَهُ، فَبَايَعَهُمْ وَاسْتَغْفَرَ لَهُمْ وَأَرْجَأَ رَسُولُ اللَّهِ ﷺ أَمْرَنَا حَتَّى قَضَى اللَّهُ فِيهِ، فَبِذَلِكَ قَالَ اللَّهُ: ﴿

﴿وَعَلَى ٱلثَّلَٰثَةِ ٱلَّذِينَ خُلِّفُوا۟﴾ وَلَيْسَ الَّذِى ذَكَرَ اللَّهُ مِمَّا خُلِّفْنَا عَنِ الْغَزْوِ إِنَّمَا هُوَ تَخْلِيفُهُ إِيَّانَا وَإِرْجَاؤُهُ أَمْرَنَا عَمَّنْ حَلَفَ لَهُ وَاعْتَذَرَ إِلَيْهِ، فَقَبِلَ مِنْهُ. [رواه البخاري: ٤٤١٨]

**1691.** Rəvayət edilir ki, Kəb ibn Malik رضي الله عنه demişdir: "Təbuk döyüşündən başqa Peyğəmbərin ﷺ apardığı döyüşlərin heç birindən yayınmamışdım. Bədr döyüşündən yayınmağıma gəlincə, ondan yayınanları Peyğəmbər ﷺ qınamamışdı. Çünki o zaman Peyğəmbər ﷺ döyüşə yox, Qureyş karvanının yolunu kəsmək üçün çıxmışdı. Allah da onları vədələşmədikləri bir yerdə düşmənləri ilə üz-üzə gətirdi. Əqəbə beyətində hamımız İslamı yaşatmağa dair Peyğəmbərə ﷺ beyət etdik. İnsanlar arasında Bədr döyüşünün Əqəbə beyətindən daha üstün sayılmasına baxmayaraq, mənim üçün Əqəbə beyəti daha sevimli idi. Təbuk döyüşünə gəldikdə isə, bu döyüşdən yayındığım zaman özümü başqa döyüşlərdə olduğundan daha qüvvətli və daha gümrah hiss edirdim. Allaha and olsun ki, bundan öncə heç vaxt mənim bir dəvədən artıq miniyim olmamışdı. Bu döyüş vaxtı isə mənim iki dəvəm var idi. Döyüşə getmək istədikdə ikibaşlı danışmaqla həqiqi məqsədini bildirməmək Peyğəmbərin ﷺ adəti idi. Peyğəmbər ﷺ Təbuk döyüşünə şiddətli bir istidə yola düşdü. Bu səfər çox uzun və təhlükəli, (qarşılaşacaqları düşmənin isə) sayı çox olduğundan, Peyğəmbər ﷺ müsəlmanlara bütün bunları nəzərə alıb hazırlıq görsünlər deyə, məqsədini açıqlayıb gedəcəyi istiqaməti xəbər verdi. O zaman Peyğəmbərin ﷺ yanında olan müsəlmanların sayı olduqca çox idi və o, bu müsəlmanların adlarını xüsusi bir kitabda qeyd etməmişdi. Heç kim döyüşdən yayınmaq istəmirdi. Yalnız döyüşdən yayınmaq istəyən az sayda müsəlman elə zənn edirdi ki, vəhy nazil olmayınca onların bu hərəkətindən Peyğəmbər ﷺ xəbər tutmayacaq. Peyğəmbər ﷺ müsəlmanlarla birgə hazırlıq görüb meyvələrin yetişdiyi və ağac kölgələrinin xoş olduğu bir isti payız günündə bu döyüşə çıxdı. O zaman onlar döyüşə hazırlaşarkən, mən də hər səhər döyüşə hazırlaşmaq məqsədilə evdən çıxır və hər axşam heç bir hazırlıq görmədən evə qayıdıb öz-özümə: "Hazırlıq görmək üçün hələ vaxt var"– deyirdim. Camaat döyüşə tam hazır olana qədər bu səhlənkarlıq məndə davam etdi. Səhəri gün Peyğəmbər ﷺ və müsəlmanlar artıq səfərə yola düşdülər. Mən isə hələ də hazırlıq görməmişdim. Mən yenə öz-özümə dedim: "Bir-iki günə hazırlıq gördükdən sonra gedib onlara çataram". Onlar Mədinədən çıxdıqdan sonra mən yenə də hazırlıq görmək üçün evdən çıxdım və heç bir iş görmədən axşam evə qayıtdım. (Ertəsi gün yenə) hazırlıq görmək üçün evdən çıxdım və heç bir iş görmədən axşam evə qayıtdım. Bu hal məndə, onların tez bir zamanda düşmənlə qarşılaşdıqları anacan davam etdi və mən bu döyüşdə iştirak etmək fürsətini əldən buraxdım. Bütün bunlara baxmayaraq, mən yenə də onlara çatmaq fikrində idim. Kaş ki, bu fikrimi doğrultdaydım. Lakin bu mənə müyəssər olmadı. Peyğəmbər ﷺ Mədinədən çıxıb döyüşə getdikdən sonra insanlar arasına çıxdıqda məni ən çox kədərləndirən o idi ki, burada yalnız münafiqlikdə ittiham olunanlar və Allahın döyüşə getməməyə rüsxət verdiyi zəiflər qalmışdı. Peyğəmbər ﷺ Təbuka gəlib çatana qədər mənim barəmdə düşünmədi. Təbukda ikən səhabələr arasında olduqda məni xatırlayıb dedi: "Kəb nə etdi?" Bəni Sələmə qəbiləsindən olan bir nəfər dedi: "Ya Rəsulullah, Kəbi iki gözəl libası və yan-yörəsinə özündən razı halda baxması Mədinədə saxladı." Muaz ibn Cəbəl dedi: "Sənin dediyin

söz necə də pisdir! Vallahi, ya Rəsulullah, biz Kəbdən yaxşılıqdan başqa bir şey görməmişdik." Peyğəmbər ﷺ heç nə demədi. Onların Mədinəyə qayıtma xəbərini eşitdikdə kədər məni bürüdü, artıq yalan danışmaq barəsində düşünməyə başladım və öz-özümə dedim: "Mən nə edim ki, sabah onun qəzəbindən xilas olum?" Sonra mən bu iş barəsində təcrübəsi olan yaxınlarımla məsləhətləşdim. Peyğəmbərin ﷺ Mədinəyə yaxınlaşması xəbəri mənə yetişdikdə bütün batil fikirləri özümdən uzaqlaşdırdım və başa düşdüm ki, uydurduğum yalan fikirlərlə özümə bəraət qazandıra bilməyəcəyəm. Ona görə də qərara gəldim ki, hər şeyi olduğu kimi Peyğəmbərə ﷺ söyləyim. Səhəri gün Peyğəmbər ﷺ Mədinəyə gəldi və adəti üzrə məscidə daxil olub iki rükət namaz qıldı. Sonra da orada olan camaatla (hal-əhval tutmaq üçün) birgə oturdu. Bu vaxt Təbuk döyüşündən yayınan səksəndən artıq kişi gəlib Peyğəmbərə ﷺ müxtəlif bəhanələr gətirməklə və and içməklə üzrxahlıq etməyə başladılar. Allahın elçisi onların aşkarda dediklərini qəbul etdi, onlardan bir daha vəd aldı, onlar üçün bağışlanma dilədi, qəlblərində gizlətdiklərini isə Allaha həvalə etdi. Bu zaman mən də Peyğəmbərin ﷺ hüzuruna gəlib ona salam verdim. Peyğəmbər ﷺ məni görcək gülümsədi, lakin qəzəbli olduğu hiss olunurdu. Peyğəmbər ﷺ: "Gəl!"– deyə məni çağırdı. Mən yaxınlaşıb onun qarşısında oturdum və o mənə dedi: "Bu döyüşdən yayınmağının səbəbi nə idi? Məgər sən bundan öncə (İslamı yaşatmağa) söz verməmişdin?" Mən dedim: "Elədir, (ya Rəsulullah,) vallahi ki, mən başqa birisinin hüzurunda olsaydım, bir bəhanə gətirməklə onun qəzəbindən canımı necə qurtaracağımı görərdin. Doğrudan da, mənim çox fəsahətli danışıq qabiliyyətim var. Vallahi, mən başa düşdüm ki, əgər mən bu gün yalan danışmaqla səni razı salsam, sonra Allah sənə həqiqəti bildirdikdə mənə qəzəblənəcəksən, lakin sənə həqiqəti söyləsəm, sənin mənə qəzəbin tutsa da Allahın məni bağışlayacağına ümid edəcəm. Xeyr, vallahi ki, mənim bu döyüşdən yayındığıma bəraət qazandıracaq heç bir üzürlü səbəbim yoxdur. Çünki mən heç vaxt özümü indiki kimi qüvvətli və gümrah hiss etməmişdim." Peyğəmbər ﷺ dedi: "Bu doğru söylədi. Ey Kəb, get, Allah sənin barəndə hökm verənə qədər səbir et." Mən çıxıb getdikdə Bəni Sələmə qəbiləsindən olan bir dəstə kişi tələsik arxamca gəlib mənə dedi: "Vallahi, biz səni bundan əvvəl günahkar bir şəxs kimi tanımırdıq. Sən döyüşdən yayınan şəxslər kimi Peyğəmbərə ﷺ üzrxahlıq etməyib aciz qaldın. Halbuki, sənin bu günahın üçün Peyğəmbərin ﷺ bağışlanma diləməyi kifayət edərdi." Vallahi, onlar məni o qədər qınadılar ki, qayıdıb yalan söylədiyimi bildirmək istədim. Sonra da: "Məndən başqa belə hərəkət edən bir kimsə varmı?"– deyə soruşdum. Onlar dedilər: "Bəli, iki nəfər də sən dediyin kimi həqiqəti söylədi və sənə deyilənlər onlara da deyildi." Mən onların kim olduğunu soruşduqda onlar: "Bu, Murara ibn Rəbi əl-Amri və Hilal ibn Ümeyyə əl-Vaqifidir"– deyib, Bədr döyüşündə iştirak etmiş, nümunəvi olan iki səhabəni mənə bildirdilər. Onlar bunu mənə söylədikdən sonra (fikrimdən dönməyib) çıxıb getdim. Peyğəmbər ﷺ döyüşdən yayınanlar arasında yalnız bizim üçümüzlə danışmağı müsəlmanlara qadağan etdi. Camaat bizdən uzaqlaşdı və onların bizə qarşı olan münasibəti dəyişdi. Hətta, bu yerlər mənim üçün qəribləşdi. Bu vəziyyət əlli gün davam etdi. Bu müddət ərzində Murara və Hilal Allahın qədərinə boyun əyməklə evlərində oturub ağlayırdılar. Mən isə onlardan daha gənc və daha

dözümlü olduğum üçün müsəlmanlarla birlikdə namazlarda iştirak edir və bazarlarda gəzib dolaşırdım, lakin mənimlə heç kəs danışmırdı. Namazdan sonra Peyğəmbərin ﷺ yanına gəlib salam verər və öz-özümə deyərdim: "Görəsən onun dodaqları tərpəndimi, mənim salamımı aldımı?" Sonra onun yaxınlığında namaz qılar və gizlincə ona nəzər salardım. Namaza gəldiyim zaman Peyğəmbər ﷺ mənə tərəf baxardı, ancaq mən ona tərəf baxdıqda o məndən üz çevirərdi. İnsanların məndən üz çevirməsi və mənə qarşı olan soyuq münasibətləri beləcə davam etdi. Bir gün mən əmim oğlu Əbu Qətadənin həyət divarını aşıb onun yanına gəldim. Əbu Qətadə ən çox sevdiyim insanlardan biri idi. Mən ona salam verdim, ancaq vallahi ki, o, mənim salamımı almadı. Mən dedim: "Ey Əbu Qətadə! Səni Allaha and verirəm, de görüm mənim Allahı və Onun Rəsulunu ﷺ sevən bir bəndə olduğumu bilirsənmi?" O susdu. Mən bir daha Allaha and verib soruşduqda, o yenə də cavab vermədi. Mən üçüncü dəfə Allaha and verib soruşdum. O dedi: "Allah və Onun Rəsulu daha yaxşı bilir!" Bu cavabdan sonra gözlərim yaşla doldu, sonra hasarı aşıb oradan uzaqlaşdım. Bir gün mən Mədinə bazarında gəzib dolaşdığım zaman ora ticarət üçün gəlmiş, Şam əhlindən olan bir nəsrani əkinçi: "Mən Kəb ibn Maliki necə tapa bilərəm?"– deyə soruşduqda, bazardakılar işarə edib məni ona göstərdilər. O yaxınlaşıb Ğəssan vilayətinin hökmdarının məktubunu mənə təqdim etdi. Orada bu sözlər yazılmışdı: "Sonrasına gəlincə... Məndə olan məlumatlara görə dostun səninlə çox sərt davranır. Doğrusu, Allah səni təhqir olunacağın və sıxıntı çəkəcəyin bir yerdə qalmaq üçün yaratmamışdır. Elə isə bizim yanımıza gəl, sənə layiqincə hörmət edək." Bu məktubu oxuduqdan sonra mən: "Bu da bir imtahandır"– deyib, onu təndirə atıb yandırdım. Qırx gün keçdikdən sonra Peyğəmbərin ﷺ göndərdiyi adam[1] gəlib mənə dedi: "Allahın elçisi sənə həyat yoldaşından uzaqlaşmağı əmr edir." Mən dedim: "Onu boşayım, ya yox?" Dedi: "Yox, (boşama), lakin ondan uzaq dur və onunla yaxınlıq etmə!" Peyğəmbər ﷺ bu xəbəri Murara və Hilala da göndərmişdi. Mən həyat yoldaşıma dedim: "Atanın evinə get və Allahın hökmü gələnə qədər orada qal!" Hilal ibn Ümeyyənin zövcəsi Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, Hilal artıq qocalmış və əldən düşmüşdür. Ona xidmət edəcək bir kimsə yoxdur. Ona xidmət göstərməyimə də qadağa qoyursan?" O dedi: "Xeyr, lakin səninlə yaxınlıq etməsin." Hilalın zövcəsi dedi: "Vallahi ki, onun heç hərəkət etməyə taqəti qalmayıb. Bu hadisə baş verəndən bəri o, dayanmadan ağlayır." Mənim də yaxınlarımdan bəziləri mənə dedilər: "Bəlkə sən də Peyğəmbərdən ﷺ izn istəyəsən və o, Hilal ibn Ümeyyənin zövcəsinə ona xidmət etmək üçün izn verdiyi kimi sənin zövcənə də izn versin." Mən dedim: "Vallahi, mən bu barədə Peyğəmbərdən ﷺ izn istəməyəcəm. Mən nə bilim ki, o nə cavab verəcək. Bundan başqa mən hələ gəncəm." Mən on gün də gözlədim və artıq Peyğəmbərin ﷺ qadağan etdiyi günlərin sayı əlliyə çatdı. Mən əllinci gün sübh namazını qılıb, evlərimizdən birinin damının üstündə Allahın ayədə zikr etdiyi vəziyyətdə, yəni ürəyim təngə gəlib sıxılmış və gen dünya mənə dar olmuş bir halda oturmuşdum ki, birdən Səl dağının üstünə çıxıb uca səslə çağıran carçının: "Ey Kəb ibn Malik, sevin!"– dediyini eşitdim. Mən dərhal səcdə etdim və anladım ki, artıq sevinc və fərəh gəlmişdi. Peyğəmbər ﷺ

---

[1] Xuzeymə ibn Sabit ؓ.

sübh namazını qıldıqdan sonra Allahın bizim tövbələrimizi qəbul etdiyini insanlara bəyan etmiş və onlar da bu şad xəbəri bizə çatdırmağa tələsmişlər. Bəziləri Muraranı və Hilalı müjdələmək üçün onların yanına getmişlər. Onlardan biri atını çaparaq məni müjdələməyə gəlmiş, digəri isə Səl dağına qalxıb oradan bu müjdəni mənə daha tez çatdırmışdı. Çünki səsin sürəti atın sürətindən daha tez çatır. Səsini eşitdiyim müjdəçi mənim yanıma gəldikdə libasımı ona verdim. Vallahi, özümün bundan başqa libasım olmadığı üçün Əbu Qətadədən libas aldım və onu geyib Peyğəmbərin ﷺ yanına getdim. Əshabələr dəstə-dəstə məni qarşılayır və tövbəmin qəbul olunması münasibətilə məni təbrik edib deyirdilər: "Allahın tövbəsi sənə xeyirli olsun!" Mən məscidə daxil olduqda, Peyğəmbər ﷺ orada oturmuş və camaat da onun ətrafına toplaşmışdı. Təlhə ibn Ubeydullah qalxaraq sürətlə mənə tərəf gəlib əlimi sıxdı və məni təbrik etdi. Allaha and olsun ki, ondan başqa mühacirlərdən heç kəs məni təbrik etmək üçün ayağa qalxmadı. Mən onun bu münasibətini heç vaxt unutmaram. Mən Peyğəmbərə ﷺ salam verdikdə, o, sevinclə parlayan üzünü mənə tərəf çevirib dedi: "Anan səni dünyaya gətirdiyi gündən bəri sənin üçün ən xeyirli olan bu günün səadətilə sevin!" Mən: "Ya Rəsulullah, bu müjdə sənin tərəfindəndir, yoxsa Allahın?"– deyə soruşduqda o dedi: "Xeyr, əksinə bu Allah tərəfindən olan müjdədir." Adətən Peyğəmbər ﷺ sevindikdə onun üzü ay parçası kimi parlayardı. Biz də onun sevindiyini bu görkəmindən hiss edərdik. Mən Peyğəmbərin ﷺ qarşısında oturub dedim: "Ya Rəsulullah, tövbəm qəbul olunduğu üçün var-dövlətimi Allah və Onun rəsuluna sədəqə etmək istəyirəm." Peyğəmbər ﷺ dedi: "Var-dövlətinin bir hissəsini özündə saxla. Bu sənin üçün daha xeyirlidir." Mən dedim: "Xeybər döyüşündə əldə olunmuş qənimətdən payıma düşən hissəni özüm üçün saxlayıram. Ya Rəsulullah! Həqiqətən, Allah məni bu sıxıntıdan yalnız doğru danışdığım üçün qurtardı. Elə buna görə də bundan sonra yalnız doğru danışacağam." Allaha and olsun ki, Peyğəmbərə ﷺ doğru söylədiyim vaxtdan bəri Allahın kimi isə doğru danışmaqda məni imtahana çəkdiyindən daha gözəl imtahana çəkdiyini bilmirəm. Bütün bunları Peyğəmbərə ﷺ söylədikdən sonra bu günədək yalan danışmaq niyyətində olmadım və Allahdan istəyirəm ki, bundan sonra da bu işdə məni qorusun. Buna görə də Allah Peyğəmbərinə ﷺ bu ayəni nazil etdi: **"Allah, *müsəlmanlardan* bəzilərinin qəlbi *cihaddan* yayınmaq üzrə olduqdan sonra, Peyğəmbərin də, çətin vaxtda onun ardınca gedən mühacirlərin və ənsarların da *əvvəlcə* tövbəsini qəbul etdi, sonra da onları bağışladı. Çünki *Allah* onlara qarşı Şəfqətlidir, Rəhmlidir. Geri qalmış üç nəfəri də *bağışladı*. Hətta yer üzü öz genişliyinə baxmayaraq onlara dar gəlmiş, ürəkləri *kədərdən* sıxılmış və yəqin bilmişdilər ki, Allahın *əzabından*, ancaq Onun Özünə sığınmaqdan başqa çarələri yoxdur. Sonra *Allah* peşman olsunlar deyə onların tövbəsini qəbul etdi. Həqiqətən, Allah tövbələri qəbul Edəndir, Rəhmlidir. Ey iman gətirənlər! Allahdan qorxun və düz danışanlarla birlikdə olun."**[1] Allaha and olsun ki, İslam nemətindən sonra Allahın mənə bəxş etdiyi nemətlərdən ən gözəli Peyğəmbərə ﷺ doğru danışmaqdır ki, yalan danışıb həlak olanlardan olmayım. Uca Allah yalan danışanları məzəmmət edərək onlar barəsində bu ayəni nazil etmişdir: **"Yanlarına qayıtdığınız zaman, onlardan əl çə-**

[1] "ət-Tovbə" surəsi, 117-119.

**kəsiniz deyə, qarşınızda Allaha and içəcəklər. Siz onlardan üz döndərin. Çünki onlar murdardırlar. Qazandıqları *günahların* cəzası olaraq sığınacaqları yer Cəhənnəm olacaqdır. Qarşınızda and içəcəklər ki, onlardan razı qalasınız. Siz onlardan razı olsanız da, Allah fasiq camaatdan razı qalmaz"[1].** Peyğəmbər ﷺ bizim üçümüzdən başqa döyüşdən yayınanların hər birindən and içib, üzr diləmələrini qəbul etdi, həmçinin onların beyətini qəbul edib onlar üçün bağışlanma dilədi. Lakin bizim barəmizdə olan hökmü Allahın əmri gələnə qədər təxirə saldı. Bu haqda Uca Allah belə buyurur: **"Geri qalmış üç nəfəri də *bağışladı*..."[2].** Bu ayədə qeyd olunmuş "geri qalanlar" ifadəsi heç də bizim Təbuk döyüşündən geri qalmağımıza işarə deyil. Əksinə, bu bizim barəmizdə olan hökmün, and içərək Peyğəmbərdən ﷺ üzr diləyənlər barəsində olan hökmdən (əlli gün) geri qalmasıdır." (əl-Buxari, 4418)

## 47-ci fəsil. Peyğəmbərin ﷺ Xosrova və Qeysərə məktub göndərməsi

## ٤٧- باب: كِتَابُ النَّبِىِّ ﷺ إِلَى كِسْرَى وَقَيْصَرَ

١٦٩٢ – عَنْ أَبِى بَكْرَةَ ﷺ قَالَ: لَقَدْ نَفَعَنِى اللَّهُ بِكَلِمَةٍ سَمِعْتُهَا مِنْ رَسُولِ اللَّهِ ﷺ أَيَّامَ الْجَمَلِ، بَعْدَ مَا كِدْتُ أَنْ أَلْحَقَ بِأَصْحَابِ الْجَمَلِ فَأُقَاتِلَ مَعَهُمْ قَالَ لَمَّا بَلَغَ رَسُولَ اللَّهِ ﷺ أَنَّ أَهْلَ فَارِسَ قَدْ مَلَّكُوا عَلَيْهِمْ بِنْتَ كِسْرَى قَالَ: «لَنْ يُفْلِحَ قَوْمٌ وَلَّوْا أَمْرَهُمُ امْرَأَةً». [رواه البخاري: ٤٤٢٥]

**1692.** Rəvayət edilir ki, Əbu Bəkrə ﷺ demişdir: "Cəməl döyüşündə[3] mən az qala bu döyüşdə vuruşanlara qoşulub onlarla bərabər (Əliyə) qarşı vuruşacaqdım, (lakin) Allah (məni saxladı,) Peyğəmbərdən ﷺ eşitdiyim bir kəlmə sayəsində mənə fayda verdi." (Bir zaman) farsların Xosrovun qızını özlərinə başçı təyin etməsi xəbəri Peyğəmbərə ﷺ gəlib çatdıqda o buyurmuşdu: "Hakimiyyəti qadına həvalə edən bir tayfa heç vaxt nicat tapmaz." (əl-Buxari, 4425)

## 48-ci fəsil. Peyğəmbərin ﷺ xəstələnməsi və onun vəfatı

## ٤٨- باب: مَرَضُ النَّبِىِّ ﷺ وَوَفَاتُهُ

١٦٩٣ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: دَعَا النَّبِىُّ ﷺ فَاطِمَةَ عليها السلام فِى شَكْوَاهُ الَّذِى قُبِضَ فِيهِ، فَسَارَّهَا بِشَىْءٍ، فَبَكَتْ، ثُمَّ دَعَاهَا فَسَارَّهَا بِشَىْءٍ فَضَحِكَتْ فَسَأَلْنَا عَنْ ذَلِكَ. فَقَالَتْ سَارَّنِى النَّبِىُّ ﷺ أَنَّهُ يُقْبَضُ فِى وَجَعِهِ الَّذِى تُوُفِّىَ فِيهِ فَبَكَيْتُ، ثُمَّ سَارَّنِى فَأَخْبَرَنِى أَنِّى أَوَّلُ أَهْلِهِ يَتْبَعُهُ فَضَحِكْتُ. [رواه البخاري: ٤٤٣٣-٤٤٣٤]

**1693.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Peyğəmbər ﷺ vəfatına səbəb olan xəstəliyə tutulduğu zaman Fatiməni çağırıb ona gizlincə nəsə dedi, o ağladı, sonra yenə ona gizlincə nəsə dedi o güldü. (Sonralar) biz ondan Peyğəmbərin ﷺ ona nə dediyini soruşduqda o dedi: "Peyğəmbər ﷺ mənə o xəstəlikdən

[1] "ət-Tovbə" surəsi, 95-96.
[2] "ət-Tovbə" surəsi, 118.
[3] "Cəməl" dəvə deməkdir. Bu döyüş milad tarixi ilə 656-cı ildə fitnə nəticəsində Əlinin ﷺ tərəfdarları ilə Təlhə ﷺ, Zubeyr ﷺ və Aişənin ﷺ tərəfdarları arasında baş vermişdir.

vəfat edəcəyini bildirdi, mən də ağladım. Sonra xəbər verdi ki, ailəsindən ona qovuşacaq ilk adam mən olacağam, mən də güldüm." (əl-Buxari, 4433-4434)

١٦٩٤ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كُنْتُ أَسْمَعُ أَنَّهُ لاَ يَمُوتُ نَبِيٌّ حَتَّى يُخَيَّرَ بَيْنَ الدُّنْيَا وَالآخِرَةِ، فَسَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ فِي مَرَضِهِ الَّذِي مَاتَ فِيهِ وَأَخَذَتْهُ بُحَّةٌ يَقُولُ: ﴿مَعَ ٱلَّذِينَ أَنۡعَمَ ٱللَّهُ عَلَيۡهِم﴾ الآيَةَ، فَظَنَنْتُ أَنَّهُ خُيِّرَ. [رواه البخاري: ٤٤٣٥]

**1694.** Rəvayət edilir ki, Aişə (r.a.) demişdir: "Mən (Peyğəmbərin ﷺ tez-tez belə dediyini eşidərdim): "Heç bir peyğəmbər özünə dünya həyatı ilə axirət arasında seçim təklif edilməyincə ölmür." (Bundan başqa) mən Peyğəmbərin ﷺ ölümü ilə nəticələnən xəstəliyə tutulduğu zaman xırıltılı səslə bu (ayəni) söylədiyini eşitdim: **"Allaha və *Onun* Elçisinə itaət edənlər Allahın özlərinə nemət bəxş etdiyi peyğəmbərlərlə, sidq ürəkdən inananlarla, şəhidlərlə və əməlisalehlərlə birlikdə olacaqlar. Onlar necə də gözəl dostlardır"[1].** Onda mən düşündüm ki, ona seçim verilmişdir." (əl-Buxari, 4435)

١٦٩٥ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ وَهُوَ صَحِيحٌ يَقُولُ: «إِنَّهُ لَمْ يُقْبَضْ نَبِيٌّ قَطُّ حَتَّى يَرَى مَقْعَدَهُ مِنَ الْجَنَّةِ ثُمَّ يُحَيَّا أَوْ يُخَيَّرَ». فَلَمَّا اشْتَكَى وَحَضَرَهُ الْقَبْضُ وَرَأْسُهُ عَلَى فَخِذِ عَائِشَةَ غُشِيَ عَلَيْهِ، فَلَمَّا أَفَاقَ شَخَصَ بَصَرُهُ نَحْوَ سَقْفِ الْبَيْتِ ثُمَّ قَالَ: «اللَّهُمَّ فِي الرَّفِيقِ الأَعْلَى». فَقُلْتُ إِذًا لاَ يُجَاوِرُنَا. فَعَرَفْتُ أَنَّهُ حَدِيثُهُ الَّذِي كَانَ يُحَدِّثُنَا وَهُوَ صَحِيحٌ. [رواه البخاري: ٤٤٣٧]

**1695.** Rəvayət edilir ki, Aişə (r.a.) demişdir: "Peyğəmbər ﷺ hələ xəstələnməmişdən qabaq deyərdi: "Heç bir peyğəmbər Cənnətdəki yerini görməyincə, üstəlik (Cənnətdəki yerini gördükdən) sonra ona salam verilməyincə,[2] yaxud ona dünya həyatı ilə axirət arasında seçim təklif edilməyincə vəfat etməmişdir."

(Hədisi danışan ravi demişdir:) "Peyğəmbər ﷺ xəstələndiyi və ölümü yaxınlaşdığı zaman, başı da Aişənin dizi üstündə ikən bayıldı. Özünə gəldikdə gözlərini evin tavanına dikib dedi: "Allahım, (məni) uca dostlara (qovuşdur)! Mən: "Elə isə Peyğəmbər ﷺ bizi seçməyəcək"- dedim və sağlam ikən belə söz dediyini bildim." (əl-Buxari, 4437)

١٦٩٦ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ إِذَا اشْتَكَى نَفَثَ عَلَى نَفْسِهِ بِالْمُعَوِّذَاتِ وَمَسَحَ عَنْهُ بِيَدِهِ فَلَمَّا اشْتَكَى وَجَعَهُ الَّذِي تُوُفِّيَ فِيهِ طَفِقْتُ أَنْفِثُ عَلَى نَفْسِهِ بِالْمُعَوِّذَاتِ، الَّتِي كَانَ يَنْفِثُ، وَأَمْسَحُ بِيَدِ النَّبِيِّ ﷺ عَنْهُ. [رواه البخاري: ٤٤٣٩]

**1696.** Rəvayət edilir ki, Aişə (r.a.) demişdir: "Peyğəmbər ﷺ xəstələndiyi zaman şərdən qoruyan surələri[3] oxuyub ovuclarına üfürər, sonra da əllərini (baş və üz nahiyəsindən başlayaraq, bacardığı qədər) bədəninin hər yerinə sürtərdi. Vəfat etməmişdən qabaq xəstəliyi şiddətləndikdə isə onun oxuyub üfürdüyü bu surələri mən onun üçün oxuyub (ovcuna) üfürər və əllərini onun bədəninə sürtərdim." (əl-Buxari, 4439)

---

[1] "ən-Nisa" surəsi, 69.

[2] Uca Allah buyurur: "O kəslər ki, tər-təmiz olduqları halda, mələklər onların canını alıb deyirlər: "Sizə salam olsun! Əməllərinizə görə Cənnətə girin!" "ən-Nəhl" surəsi, 32.

[3] Yəni "əl-İxlas", "əl-Fələq" və "ən-Nas" surələrini.

١٦٩٧ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهَا سَمِعَت النَّبِىَّ ﷺ وَأَصْغَتْ إِلَيْهِ قَبْلَ أَنْ يَمُوتَ، وَهُوَ مُسْنِدٌ إِلَيَّ ظَهْرَهُ يَقُولُ: «اللَّهُمَّ اغْفِرْ لِى وَارْحَمْنِى، وَأَلْحِقْنِى بِالرَّفِيقِ». [رواه البخاري: ٤٤٤٠]

**1697.** Rəvayət edilir ki, Aişə (r.a) Peyğəmbərin ﷺ vəfatından öncə kürəyini ona söykəyib belə dediyini eşitmişdir: “Allahım, məni bağışla, mənə rəhm et və məni (uca) dostlara qovuşdur!” (əl-Buxari, 4440)

١٦٩٨ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: مَاتَ النَّبِىُّ ﷺ وَإِنَّهُ لَبَيْنَ حَاقِنَتِى وَذَاقِنَتِى، فَلاَ أَكْرَهُ شِدَّةَ الْمَوْتِ لأَحَدٍ أَبَدًا بَعْدَ النَّبِىِّ ﷺ. [رواه البخاري: ٤٤٤٦]

**1698.** Rəvayət edilir ki, Aişə (r.a) demişdir: “Peyğəmbər ﷺ vəfat edərkən onun başı mənim sinəmin üstündə idi. Peyğəmbərin ﷺ vəfatından sonra mən heç vaxt heç kəsin ölüm bihuşluğuna bu qədər nifrət etmədim.” (əl-Buxari, 4446)

١٦٩٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ عَلِيَّ بْنَ أَبِى طَالِبٍ رضي الله عنه خَرَجَ مِنْ عِنْدِ رَسُولِ اللَّهِ ﷺ فِى وَجَعِهِ الَّذِى تُوُفِّىَ فِيهِ، فَقَالَ النَّاسُ يَا أَبَا حَسَنٍ، كَيْفَ أَصْبَحَ رَسُولُ اللَّهِ ﷺ فَقَالَ أَصْبَحَ بِحَمْدِ اللَّهِ بَارِئًا، فَأَخَذَ بِيَدِهِ عَبَّاسُ بْنُ عَبْدِ الْمُطَّلِبِ، فَقَالَ لَهُ أَنْتَ وَاللَّهِ بَعْدَ ثَلاَثٍ عَبْدُ الْعَصَا، وَإِنِّى وَاللَّهِ لأُرَى رَسُولَ اللَّهِ ﷺ سَوْفَ يُتَوَفَّى مِنْ وَجَعِهِ هَذَا، إِنِّى لأَعْرِفُ وُجُوهَ بَنِى عَبْدِ الْمُطَّلِبِ عِنْدَ الْمَوْتِ، اذْهَبْ بِنَا إِلَى رَسُولِ اللَّهِ ﷺ فَلْنَسْأَلْهُ فِيمَنْ هَذَا الأَمْرُ، إِنْ كَانَ فِينَا عَلِمْنَا ذَلِكَ، وَإِنْ كَانَ فِى غَيْرِنَا عَلِمْنَاهُ فَأَوْصَى بِنَا. فَقَالَ عَلِىٌّ إِنَّا وَاللَّهِ لَئِنْ سَأَلْنَاهَا رَسُولَ اللَّهِ ﷺ فَمَنَعَنَاهَا لاَ يُعْطِينَاهَا النَّاسُ بَعْدَهُ، وَإِنِّى وَاللَّهِ لاَ أَسْأَلُهَا رَسُولَ اللَّهِ ﷺ. [رواه البخاري: ٤٤٤٧]

**1699.** Rəvayət edilir ki, ibn Abbas (r.a) demişdir: “Peyğəmbər ﷺ ölümü ilə nəticələnən xəstəliyə tutulduğu zaman Əli ibn Əbu Talib onun evindən bayıra çıxdıqda camaat dedi: “Ey Əbu Həsən, bu səhər Peyğəmbər ﷺ özünü necə hiss edir?” Əli dedi: “Allaha həmd olsun, bu səhər onun vəziyyəti çox yaxşıdır.” Bu vaxt Abbas ibn Abdul-Muttəlib onun əlindən tutub dedi: “Vallahi, üç gündən sonra sən başqasının itaətində olacaqsan. Vallahi, mən güman edirəm ki, Allahın elçisi ﷺ bu xəstəliyindən vəfat edəcək. Mən Abdul-Muttəlib oğullarının üzlərinin ölüm ayağında necə görkəm aldığını yaxşı bilirəm. Gedək Rəsulullahdan ﷺ hakimiyyətin kimlərə həvalə ediləcəyini soruşaq. Əgər bizə nəsib olarsa, bunu bilərik, yox, əgər başqalarına qismət olarsa, ondan da xəbərimiz olar. Həm də bizə dair[1] öz vəsiyyətini edər.” Əli dedi: “Vallahi, əgər biz bunu Peyğəmbərdən ﷺ istəsək və o bunu bizə verməsə, ondan sonra insanlar onu bizə əsla verməyəcəklər. Vallahi, mən bunu Peyğəmbərdən ﷺ istəməyəcəyəm.” (əl-Buxari, 4447)

١٧٠٠ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهَا كَانَتْ تَقُولُ: إِنَّ مِنْ نِعَمِ اللَّهِ عَلَىَّ أَنَّ رَسُولَ اللَّهِ ﷺ تُوُفِّىَ فِى بَيْتِى وَفِى يَوْمِى، وَبَيْنَ سَحْرِى وَنَحْرِى، وَأَنَّ اللَّهَ جَمَعَ بَيْنَ رِيقِى وَرِيقِهِ عِنْدَ مَوْتِهِ، دَخَلَ عَلَىَّ عَبْدُ الرَّحْمَنِ وَبِيَدِهِ السِّوَاكُ وَأَنَا مُسْنِدَةٌ رَسُولَ اللَّهِ ﷺ فَرَأَيْتُهُ يَنْظُرُ إِلَيْهِ، وَعَرَفْتُ أَنَّهُ يُحِبُّ السِّوَاكَ فَقُلْتُ آخُذُهُ لَكَ فَأَشَارَ بِرَأْسِهِ أَنْ نَعَمْ، فَتَنَاوَلْتُهُ فَاشْتَدَّ عَلَيْهِ وَقُلْتُ أُلَيِّنُهُ لَكَ فَأَشَارَ بِرَأْسِهِ أَنْ نَعَمْ، فَلَيَّنْتُهُ، وَبَيْنَ يَدَيْهِ رَكْوَةٌ – أَوْ عُلْبَةٌ يَشُكُّ عُمَرُ – فِيهَا مَاءٌ، فَجَعَلَ يُدْخِلُ يَدَيْهِ فِى الْمَاءِ فَيَمْسَحُ بِهِمَا وَجْهَهُ يَقُولُ: «لاَ إِلَهَ إِلاَّ اللَّهُ، إِنَّ لِلْمَوْتِ سَكَرَاتٍ». ثُمَّ نَصَبَ يَدَهُ فَجَعَلَ يَقُولُ: «فِى الرَّفِيقِ الأَعْلَى». حَتَّى قُبِضَ وَمَالَتْ يَدُهُ. [رواه البخاري: ٤٤٤٩]

[1] Əshabələrinə əhli-beytin qayğısına qalmağı tövsiyə edər.

**1700.** Rəvayət edilir ki, Aişə ﵂ deyərdi: "Allahın mənə bəxş etdiyi nemətlərdən (bir də o idi ki,) Peyğəmbər ﷺ mənim evimdə, mənim (növbəm çatdığı) gün[1] və başı mənim sinəmin üstündə ikən vəfat etdi. O, can verərkən Allahın izni ilə mənim ağız suyum onun ağız suyuna qarışdı. Mən Peyğəmbərin ﷺ başını sinəmə söykəyib oturduğum vaxt (qardaşım) Adbur-Rəhman əlində misvak[2] içəri daxil oldu. Mən Peyğəmbərin ﷺ ona baxdığını görüb anladım ki, o, misvakdan istifadə etmək istəyir. (Ondan): "Sənə misvak gətirimmi?"– deyə soruşdum. Başı ilə işarə edib razılığını bildirdi. Mən misvakı götürüb (ona verdim,) lakin onun buna gücü çatmadı[3]. Mən: "Onu sənin üçün yumşaldımmı?"– deyə soruşdum. Başı ilə işarə edib razılığını bildirdi. Mən (misvakın ucunu) çeynəyib (ona verdim) və o, misvakla dişlərini sürtdü. (Peyğəmbərin ﷺ) qabağında bir qab (yaxud bir cam) su var idi. O, əllərini suyun içinə salır, sonra (yaş əllərini) üzünə sürtüb deyirdi: "Lə ilahə illəllah! Həqiqətən də, ölümün bihuşluğu vardır." Sonra əlini qaldırıb: "(Allahım, məni) uca dostlara (qovuşdur)!"– deməyə başladı. Nəhayət, ruhu bədənindən çıxdı və əli yanına düşdü. (əl-Buxari, 4449)

١٧٠١ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: لَدَدْنَا النَّبِيَّ ﷺ فِي مَرَضِهِ فَجَعَلَ يُشِيرُ إِلَيْنَا أَنْ لاَ تَلُدُّونِي فَقُلْنَا كَرَاهِيَةُ الْمَرِيضِ لِلدَّوَاءِ. فَلَمَّا أَفَاقَ قَالَ: «أَلَمْ أَنْهَكُمْ أَنْ تَلُدُّونِي». قُلْنَا كَرَاهِيَةَ الْمَرِيضِ لِلدَّوَاءِ. فَقَالَ: «لاَ يَبْقَى أَحَدٌ فِي الْبَيْتِ إِلاَّ لُدَّ – وَأَنَا أَنْظُرُ – إِلاَّ الْعَبَّاسَ، فَإِنَّهُ لَمْ يَشْهَدْكُمْ». [رواه البخاري: ٤٤٥٨]

**1701.** Rəvayət edilir ki, Aişə ﵂ deyərdi: "Peyğəmbər ﷺ xəstələnərkən biz onun ağzına dərman qoyduq, lakin o, (başı ilə) bizə işarə edib dərman istəmədiyini bildirdi. Biz dedik: "(Bu ona görədir ki,) heç bir xəstə dərman xoşlamır." Peyğəmbər ﷺ ayıldıqdan sonra dedi: "Məgər mən sizə işarə edib ağzıma dərman qoymağı qadağan etmədimmi?" Biz dedik: "(Elə bildik ki,) heç bir xəstə dərman xoşlamadığı kimi (sən də xoşlamırsan)." Peyğəmbər ﷺ buyurdu: "Qoy evin içində olan hər kəsə gözümün qabağında dərman verilsin. Yalnız Abbasdan başqa. Çünki o burada yox idi." (əl-Buxari, 4458)

١٧٠٢ – عَنْ أَنَسٍ ﵁ قَالَ: لَمَّا ثَقُلَ النَّبِيُّ ﷺ جَعَلَ يَتَغَشَّاهُ، فَقَالَتْ فَاطِمَةُ ﵍ وَاكَرْبَ أَبَاهُ. فَقَالَ لَهَا: «لَيْسَ عَلَى أَبِيكِ كَرْبٌ بَعْدَ الْيَوْمِ». [رواه البخاري: ٤٤٦٢]

**1702.** Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "(Ölümündən qabaq) Peyğəmbərin ﷺ vəziyyəti ağırlaşarkən o bayılmağa başladı." Bu vaxt Fatimə ﵍ dedi: "Yazıq atam, iztirab çəkir!" Peyğəmbər ﷺ (özünə gəldikdə) buyurdu: "Bu gündən sonra mən daha iztirab çəkməyəcəyəm!" (əl-Buxari, 4462)

## 49-cu fəsil. Peyğəmbərin ﷺ vəfatı — ٤٩ – باب: وَفَاةُ النَّبِيِّ ﷺ

١٧٠٣ – عَنْ عَائِشَةَ ﵂ أَنَّ رَسُولَ اللَّهِ ﷺ تُوُفِّيَ وَهُوَ ابْنُ ثَلاَثٍ وَسِتِّينَ. [رواه البخاري: ٤٤٦٦]

**1703.** Aişə ﵂ demişdir ki, Peyğəmbər ﷺ altmış üç yaşında vəfat etmişdir. (əl-Buxari, 4466)

---

[1] Peyğəmbər ﷺ gündəlik olaraq hər gecə bir zövcəsinin yanında qalardı.
[2] 181-ci hədisin qeydlərinə bax.
[3] Ağrılar Peyğəmbəri ﷺ elə haldan salmışdı ki, hətta çubuğu belə çeynəməyə halı qalmamışdı.

# ٦٥ – كِتَابُ التَّفْسِيرِ

# 65 – Təfsir kitabı

## سُورَةُ الفاتحة

## əl-Fatihə surəsi

### ١ – باب: مَا جَاءَ فِى فَاتِحَةِ الْكِتَابِ

### 1-ci fəsil. Kitabı açan (surə) barədə deyilənlər

١٧٠٤ – عَنْ أَبِى سَعِيدِ بْنِ الْمُعَلَّى ﷺ قَالَ: كُنْتُ أُصَلِّى فِى الْمَسْجِدِ فَدَعَانِى رَسُولُ اللَّهِ ﷺ فَلَمْ أُجِبْهُ، فَقُلْتُ يَا رَسُولَ اللَّهِ إِنِّى كُنْتُ أُصَلِّى، فَقَالَ: «أَلَمْ يَقُلِ اللَّهُ: ﴿ٱسْتَجِيبُواْ لِلَّهِ وَلِلرَّسُولِ إِذَا دَعَاكُمْ﴾ ثُمَّ قَالَ لِى: لأُعَلِّمَنَّكَ سُورَةً هِىَ أَعْظَمُ السُّوَرِ فِى الْقُرْآنِ قَبْلَ أَنْ تَخْرُجَ مِنَ الْمَسْجِدِ»، ثُمَّ أَخَذَ بِيَدِى ، فَلَمَّا أَرَادَ أَنْ يَخْرُجَ قُلْتُ لَهُ أَلَمْ تَقُلْ: «لأُعَلِّمَنَّكَ سُورَةً هِىَ أَعْظَمُ سُورَةٍ فِى الْقُرْآنِ»، قَالَ: ﴿ٱلْحَمْدُ لِلَّهِ رَبِّ ٱلْعَٰلَمِينَ﴾ هِىَ السَّبْعُ الْمَثَانِى وَالْقُرْآنُ الْعَظِيمُ الَّذِى أُوتِيتُهُ». [رواه البخاري: ٤٤٧٤]

**1704.** Rəvayət edilir ki, Əbu Səid ibn əl-Muəlla ﷺ demişdir: "(Bir dəfə) mən məsciddə namaz qılarkən Peyğəmbər ﷺ məni çağırdı, lakin mən ona cavab vermədim. (Namazımı bitirdikdən) sonra dedim: "Ya Rəsulullah, mən namaz qılırdım!" Peyğəmbər ﷺ buyurdu: "Məgər Allah: **"*Peyğəmbər* sizi, həyat verəcək şeylərə çağırdığı zaman Allahın və Onun Peyğəmbərinin çağırışına cavab verin."[1]**– deyə buyurmayıbmı?" Sonra o mənə dedi: "Məsciddən çıxmazdan əvvəl sənə Quranda olan ən əzəmətli surəni öyrədəcəyəm!" (Bir müddətdən) sonra Peyğəmbər ﷺ mənim əlimdən tutub məsciddən çıxmaq istəyəndə dedim: "Məgər sən deməmişdin ki: "Məsciddən çıxmazdan əvvəl sənə Quranda olan ən əzəmətli surəni öyrədəcəyəm?!" O buyurdu: **"Həmd olsun aləmlərin Rəbbi Allaha..."[2]** Bu, yalnız mənə verilmiş təkrarlanan yeddi ayə və əzəmətli Qurandır.[3]" (əl-Buxari, 4474)

[1] "əl-Ənfal" surəsi, 24.
[2] "əl-Fatihə" surəsi, 2.
[3] Ərəbcə buna "Səbul-Məsani" deyilir ki, bu da "əl-Fatihə" surəsinin adlarından biridir. "əl-Fatihə" surəsinin əzəməti ondadır ki, bu surə məna baxımından bütün Quranı özündə cəm etmişdir.

## سُورَةُ البَقَرَةِ

## əl-Bəqərə surəsi

### ٢ – باب: ﴿فَلَا تَجْعَلُوا لِلَّهِ أَندَادًا وَأَنتُمْ تَعْلَمُونَ﴾

### 2-ci fəsil.
### Qüdrətli və Əzəmətli Allahın: "...Siz də *bunu* bildiyiniz halda *heç kəsi* Allaha tay tutmayın"[1] ayəsi barədə deyilənlər

١٧٠٥ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: سَأَلْتُ النَّبِيَّ ﷺ أَيُّ الذَّنْبِ أَعْظَمُ عِنْدَ اللَّهِ؟ قَالَ: «أَنْ تَجْعَلَ لِلَّهِ نِدًّا وَهُوَ خَلَقَكَ». قُلْتُ إِنَّ ذَلِكَ لَعَظِيمٌ، قُلْتُ ثُمَّ أَيُّ؟ قَالَ: «وَأَنْ تَقْتُلَ وَلَدَكَ تَخَافُ أَنْ يَطْعَمَ مَعَكَ». قُلْتُ ثُمَّ أَيُّ؟ قَالَ: «أَنْ تُزَانِيَ حَلِيلَةَ جَارِكَ». [رواه البخاري: ٤٤٧٧]

**1705.** Rəvayət edilir ki, Abdullah (ibn Məsud) ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərdən ﷺ soruşdum ki: "Hansı günah Allah yanında ən böyük günah sayılır?" Dedi: "Səni yaradan Allaha (başqa birisini) tay tutmağındır!" Mən: "Doğrudan da, bu, böyük günahdır"– dedim, sonra (yenə) soruşdum: "Bəs sonra hansıdır?" Dedi: "Övladının səninlə birgə yemək yeyəcəyindən qorxub onu öldürmək!" Mən soruşdum: "Sonra hansıdır?" Dedi: "Qonşunun zövcəsi ilə zina etmək!"[2] (əl-Buxari, 4477)

### ٣ – باب: قَوْلُهُ تَعَالَى: ﴿وَظَلَّلْنَا عَلَيْكُمُ الْغَمَامَ وَأَنزَلْنَا عَلَيْكُمُ الْمَنَّ وَالسَّلْوَىٰ﴾

### 3-cü fəsil.
### Uca Allahın: "Biz sizin üstünüzə buludla kölgə saldıq, sizə manna və bildirçin endirdik *və:* "Sizə ruzi olaraq verdiyimiz pak şeylərdən yeyin!"– *dedik*. Onlar Bizə deyil, ancaq özlərinə zülm etdilər"[3] sözü

١٧٠٦ – عَنْ سَعِيدِ بْنِ زَيْدٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: «الْكَمْأَةُ مِنَ الْمَنِّ، وَمَاؤُهَا شِفَاءٌ لِلْعَيْنِ». [رواه البخاري: ٤٤٧٨]

**1706.** Səid ibn Zeyd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bu,) mannadan olan kitrədir[4], suyu da gözə dərmandır." (əl-Buxari, 4478)

---

[1] "əl-Bəqərə" surəsi, 22.

[2] Digər isnadla rəvayət olunmuş bu hədisin tamamında deyilir: "...Uca Allah onun dediyini təsdiq edib, bu ayəni nazil etdi: "Onlar Allahla yanaşı başqa məbuda yalvarmaz, Allahın haram etdiyi cana haqsız yerə qıymaz və zina etməzlər." "əl-Furqan" surəsi, 68.

[3] "əl-Bəqərə" surəsi, 57.

[4] Kitrə: bəzi ağac və kol bitkilərinin gövdələrindən axan yapışqanabənzər yarımşəffaf qatı maye.

٤ – باب:

قَوْلُهُ تَعَالَى: ﴿وَإِذْ قُلْنَا ٱدْخُلُوا۟ هَٰذِهِ ٱلْقَرْيَةَ﴾

## 4-cü fəsil.
## Uca Allahın: "O zaman Biz dedik: –Bu kəndə daxil olun və orada istədiyiniz yerlərdə, rahatlıqla yeyin, için. Qapıdan səcdə edərək daxil olun və: "Bizi bağışla!"– deyin ki, sizin günahlarınızı bağışlayaq". Biz yaxşı işlər görənlərə *mükafatlarını* artırarıq"[1] sözü

١٧٠٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: قِيلَ لِبَنِي إِسْرَائِيلَ: ﴿وَٱدْخُلُوا۟ ٱلْبَابَ سُجَّدًا وَقُولُوا۟ حِطَّةٌ﴾ فَدَخَلُوا يَزْحَفُونَ عَلَى أَسْتَاهِهِمْ فَبَدَّلُوا وَقَالُوا حِنْطَةٌ حَبَّةٌ فِي شَعَرَةٍ. [رواه البخاري: ٤٤٧٩]

**1707.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İsrail oğullarına belə buyrulmuşdur: **"Qapıdan səcdə edərək daxil olun və: "Hittə![2]"– deyin."** Onlar isə oraya yanları üstə sürünə-sürünə daxil oldular və (özlərinə əmr edilmiş sözü) dəyişdirib: "Hintə (yəni) sünbülün üstündəki buğda"– dedilər." (əl-Buxari, 4479)

٥ – باب:

قَوْلُهُ تَعَالَى: ﴿مَا نَنسَخْ مِنْ ءَايَةٍ أَوْ نُنسِهَا نَأْتِ بِخَيْرٍ مِّنْهَآ أَوْ مِثْلِهَآ﴾

## 5-ci fəsil.
## Uca Allahın: "Biz *hər hansı* bir ayəni dəyişdirir və ya onu unutdururuqsa, ondan daha yaxşısını, və ya ona bənzərini gətiririk. Məgər bilmirsən ki, Allah hər şeyə qadirdir?"[3] sözü

١٧٠٨ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: قَالَ عُمَرُ ﷺ أَقْرَؤُنَا أُبَيٌّ وَأَقْضَانَا عَلِيٌّ وَإِنَّا لَنَدَعُ مِنْ قَوْلِ أُبَيٍّ وَذَاكَ أَنَّ أُبَيًّا يَقُولُ: لاَ أَدَعُ شَيْئًا سَمِعْتُهُ مِنْ رَسُولِ اللَّهِ ﷺ وَقَدْ قَالَ اللَّهُ تَعَالَى: ﴿مَا نَنسَخْ مِنْ ءَايَةٍ أَوْ نُنسِهَا﴾ [رواه البخاري: ٤٤٨١]

**1708.** İbn Abbas ﷺ rəvayət edir ki, Ömər ﷺ demişdir: "Aramızda Quranı ən gözəl oxuyan Ubeydir və (şəriətlə bağlı) ən düzgün hökm verən Əlidir. Buna rəğmən biz Ubeyin dediklərinə məhəl qoymuruq. Halbuki Ubey deyir: "Mən Peyğəmbərdən ﷺ eşitdiklərimdən heç bir şeyi gizlətmirəm. Çünki Uca Allah buyurur: "Biz *hər hansı* bir ayəni dəyişdirir və ya onu unutdururuqsa,..." (əl-Buxari, 4481)

---

[1] "əl-Bəqərə" surəsi, 58.
[2] "Bizi bağışla!" deməkdir.
[3] "əl-Bəqərə" surəsi, 106.

٦– باب:

قَوْلُهُ تَعَالَى: ﴿وَقَالُوا۟ ٱتَّخَذَ ٱللَّهُ وَلَدًا ۗ سُبْحَـٰنَهُۥ﴾

## 6-cı fəsil.
## Uca Allahın: "Onlar dedilər: –Allah *Özünə* övlad götürmüşdür!" Halbuki O, pakdır, müqəddəsdir! Həqiqətən, göylərdə və yerdə nə varsa, Ona məxsusdur. Hər şey Ona baş əyir"[1] sözü

١٧٠٩ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: قَالَ اللَّهُ: «كَذَّبَنِي ابْنُ آدَمَ وَلَمْ يَكُنْ لَهُ ذَلِكَ وَشَتَمَنِي وَلَمْ يَكُنْ لَهُ ذَلِكَ فَأَمَّا تَكْذِيبُهُ إِيَّايَ فَزَعَمَ أَنِّي لاَ أَقْدِرُ أَنْ أُعِيدَهُ كَمَا كَانَ وَأَمَّا شَتْمُهُ إِيَّايَ فَقَوْلُهُ لِي وَلَدٌ فَسُبْحَانِي أَنْ أَتَّخِذَ صَاحِبَةً أَوْ وَلَدًا». [رواه البخاري: ٤٤٨٢]

**1709.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Uca Allah buyurur: "Adəm övladı Məni yalançı sayır, halbuki, bunu etməyə onun haqqı yoxdur, habelə o, Məni təhqir edir, halbuki buna da onun haqqı yoxdur. Məni yalançı sayması, onu öldürdükdən sonra yenidən yaradacağımı təkzib etməsidir, Məni təhqir etməsi isə, Mənə övlad isnad etməsidir. Halbuki Mən pak və müqəddəsəm, Özümə zövcə və ya övlad götürməkdən uzağam!" (əl-Buxari, 4482)

٧– باب:

قَوْلُهُ تَعَالَى: ﴿وَٱتَّخِذُوا۟ مِن مَّقَامِ إِبْرَٰهِـۧمَ مُصَلًّى ۖ﴾

## 7-ci fəsil.
## Uca Allahın: "Biz *müqəddəs* Evi insanlar üçün ziyarət və əmin-amanlıq yeri etdik. "İbrahimin dayandığı yeri namazgah edin!" Biz İbrahimə və İsmailə: "Evimi təvaf edənlər, etikafa girənlər, rüku və səcdə edənlər üçün təmizləyin!"– dedik"[2] sözü

١٧١٠ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: قَالَ عُمَرُ رضي الله عنه وَافَقْتُ اللَّهَ فِي ثَلاَثٍ أَوْ وَافَقَنِي رَبِّي فِي ثَلاَثٍ قُلْتُ: يَا رَسُولَ اللَّهِ لَوْ اتَّخَذْتَ مَقَامَ إِبْرَاهِيمَ مُصَلًّى وَقُلْتُ: يَا رَسُولَ اللَّهِ يَدْخُلُ عَلَيْكَ الْبَرُّ وَالْفَاجِرُ فَلَوْ أَمَرْتَ أُمَّهَاتِ الْمُؤْمِنِينَ بِالْحِجَابِ فَأَنْزَلَ اللَّهُ آيَةَ الْحِجَابِ قَالَ: وَبَلَغَنِي مُعَاتَبَةُ النَّبِيِّ ﷺ بَعْضَ نِسَائِهِ فَدَخَلْتُ عَلَيْهِنَّ قُلْتُ: إِنْ انْتَهَيْتُنَّ أَوْ لَيُبَدِّلَنَّ اللَّهُ رَسُولَهُ ﷺ خَيْرًا مِنْكُنَّ حَتَّى أَتَيْتُ إِحْدَى نِسَائِهِ قَالَتْ: يَا عُمَرُ أَمَا فِي رَسُولِ اللَّهِ ﷺ مَا يَعِظُ نِسَاءَهُ حَتَّى تَعِظَهُنَّ أَنْتَ فَأَنْزَلَ اللَّهُ: ﴿عَسَىٰ رَبُّهُۥٓ إِن طَلَّقَكُنَّ أَن يُبْدِلَهُۥٓ أَزْوَٰجًا خَيْرًا مِّنكُنَّ مُسْلِمَـٰتٍ﴾ الآيَةَ. [رواه البخاري: ٤٤٨٣]

**1710.** Ənəs رضي الله عنه rəvayət edir ki, Ömər رضي الله عنه demişdir: "Mənim (dediklərim) Allahın üç (ayəsi ilə) eyni gəlmiş və ya Rəbbim (nazil edəcəyi) üç (ayənin məğzini) əv-

---
[1] "əl-Bəqərə" surəsi, 116.
[2] "əl-Bəqərə" surəsi, 125.

vəlcədən mənə agah etmişdir. (Bir dəfə mən Peyğəmbərə ﷺ): "Ya Rəsulullah, bəlkə, İbrahimin durduğu yeri namazgah edəsən!"– dedim (və buna dair ayə[1] nazil oldu). (Yenə bir dəfə): "Ya Rəsulullah, sənin evinə həm xoşniyyətli, həm də pisniyyətli adamlar gəlir. Bəlkə möminlərin analarına hicab geyməyi əmr edəsən?!"– dedim, Allah da hicab ayəsini[2] nazil etdi. (Bir dəfə) mən Peyğəmbərin ﷺ öz zövcələrindən bəzilərini tənbeh etdiyindən xəbər tutdum və onların yanına gəlib dedim: "Siz ya (özbaşınalığınıza) son qoyacaqsınız, ya da Allah öz Peyğəmbərinə ﷺ sizdən daha xeyirlisini nəsib edəcəkdir. Nəhayət, onun zövcələrindən birinin yanına gəldim və o mənə dedi: "Ey Ömər! Bəyəm Rəsulullah ﷺ zövcələrinə özü öyüd-nəsihət verə bilmir ki, sən onlara nəsihət verirsən?! Uca Allah da (bu ayəni) nazil etdi: **"Əgər o sizi boşasa, Rəbbi sizin əvəzinizə ona sizdən daha yaxşı zövcələr – müsəlman, mömin, itaətkar, tövbə edən, ibadət edən, oruc tutan dul qadınlar və bakirə qızlar verə bilər."**[3] (əl-Buxari, 4483)

## ٨– باب:

## قَوْلُهُ تَعَالَى: ﴿ قُولُوٓاْ ءَامَنَّا بِٱللَّهِ وَمَآ أُنزِلَ إِلَيْنَا ﴾

## 8-ci fəsil.
## Uca Allahın: "Deyin: "Biz Allaha, bizə nazil olana, İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun nəslinə nazil olana, Musa və İsaya verilənlərə, özlərinin Rəbbi tərəfindən peyğəmbərlərə verilənlərə iman gətirdik. Biz onların arasında fərq qoymuruq. Biz yalnız Ona təslim olanlarıq!"[4] sözü

١٧١١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: كَانَ أَهْلُ الْكِتَابِ يَقْرَءُونَ التَّوْرَاةَ بِالْعِبْرَانِيَّةِ وَيُفَسِّرُونَهَا بِالْعَرَبِيَّةِ لأَهْلِ الإِسْلاَمِ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ لاَ تُصَدِّقُوا أَهْلَ الْكِتَابِ وَلاَ تُكَذِّبُوهُمْ وَقُولُوا: ﴿ ءَامَنَّا بِٱللَّهِ وَمَآ أُنزِلَ إِلَيْنَا ﴾ الآيَةَ. [رواه البخاري: ٤٤٨٥]

**1711.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "(Bir zamanlar) Kitab əhli Tövratı müsəlmanlara ibrani dilində oxuyar, sonra da ərəb dilində izah edərdilər. (İslam dini gəldikdən sonra) Peyğəmbər ﷺ buyurdu: "Kitab əhlinə inanmayın və onları yalançı da saymayın, lakin deyin: "Biz Allaha, bizə nazil olana, İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun nəslinə nazil olana, Musaya və İsaya verilənlərə, özlərinin Rəbbi tərəfindən peyğəmbərlərə verilənlərə iman gətirdik." (əl-Buxari, 4485)

---

[1] "əl-Bəqərə" surəsi, 125.
[2] "əl-Əhzab" surəsi, 53.
[3] "ət-Təhrim" surəsi, 5.
[4] "əl-Bəqərə" surəsi, 136.

## ٩– باب: قَوْلُهُ تَعَالَى: ﴿ وَكَذَٰلِكَ جَعَلْنَٰكُمْ أُمَّةً وَسَطًا لِّتَكُونُوا۟ شُهَدَآءَ عَلَى ٱلنَّاسِ وَيَكُونَ ٱلرَّسُولُ عَلَيْكُمْ شَهِيدًا ﴾

## 9-cu fəsil.
## Uca Allahın: "Beləliklə, Biz sizi orta bir ümmət etdik ki, siz insanlara şahid olasınız, peyğəmbər də sizə şahid olsun..."[1] sözü

١٧١٢ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ يُدْعَى نُوحٌ يَوْمَ الْقِيَامَةِ فَيَقُولُ لَبَّيْكَ وَسَعْدَيْكَ يَا رَبِّ فَيَقُولُ هَلْ بَلَّغْتَ فَيَقُولُ نَعَمْ فَيُقَالُ لِأُمَّتِهِ هَلْ بَلَّغَكُمْ فَيَقُولُونَ مَا أَتَانَا مِنْ نَذِيرٍ فَيَقُولُ مَنْ يَشْهَدُ لَكَ فَيَقُولُ مُحَمَّدٌ وَأُمَّتُهُ فَتَشْهَدُونَ أَنَّهُ قَدْ بَلَّغَ: ﴿وَيَكُونَ ٱلرَّسُولُ عَلَيْكُمْ شَهِيدًا﴾ فَذَلِكَ قَوْلُهُ جَلَّ ذِكْرُهُ: ﴿ وَكَذَٰلِكَ جَعَلْنَٰكُمْ أُمَّةً وَسَطًا لِّتَكُونُوا۟ شُهَدَآءَ عَلَى ٱلنَّاسِ وَيَكُونَ ٱلرَّسُولُ عَلَيْكُمْ شَهِيدًا ﴾. [رواه البخاري: ٤٤٨٧]

**1712.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü (Allah) Nuhu çağıracaq və Nuh: "Buyur, hüzurundayam və əmrinə müntəzirəm, ey Rəbbim!"– deyəcək. Allah deyəcək: "Sən (dini) təbliğ etdinmi?" O: "Bəli!"– deyə cavab verəcək. Sonra onun qövmünə deyəcək: "O sizə (dini) təbliğ edibmi?" Onlar: "Bizi xəbərdar edən bir peyğəmbər gəlməmişdir!"– deyə cavab verəcəklər. Allah (Nuha) buyuracaq: "Sənin dediyinə kim şahidlik edə bilər?" Nuh: "Muhəmməd və onun ümməti!" – deyə cavab verəcək, beləliklə də onlar Allahın elçisi ilə bərabər Nuhun dini təbliğ etdiyinə şahidlik edəcəklər. Bu haqda Allahın ayəsində belə deyilir: **"Beləliklə, Biz sizi orta bir ümmət etdik ki, siz insanlara şahid olasınız, peyğəmbər də sizə şahid olsun."** (əl-Buxari, 4487)

## ١٠– باب: قَوْلُهُ تَعَالَى: ﴿فَمَن تَمَتَّعَ بِٱلْعُمْرَةِ إِلَى ٱلْحَجِّ﴾

## 10-cu fəsil.
## Uca Allahın: "...ümrəni *bitirib* həccə qədər *qadağan olunanlardan* istifadə edən kəs..."[2] sözü

١٧١٣ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ رضي الله عنهما قَالَ: أُنْزِلَتْ آيَةُ الْمُتْعَةِ فِي كِتَابِ اللَّهِ فَفَعَلْنَاهَا مَعَ رَسُولِ اللَّهِ ﷺ وَلَمْ يُنْزَلْ قُرْآنٌ يُحَرِّمُهُ وَلَمْ يَنْهَ عَنْهَا حَتَّى مَاتَ قَالَ رَجُلٌ بِرَأْيِهِ مَا شَاءَ. [رواه البخاري: ٤٥١٨]

**1713.** Rəvayət edilir ki, İmran ibn Husayn ﷺ demişdir: "Allahın Kitabında təməttu (həcci) barəsində ayə nazil olmuş və biz Peyğəmbərin ﷺ yanında ona əməl etmişik. Peyğəmbər ﷺ vəfat edənədək bu ayəni haram buyuran və ya onu qadağan edən bir ayə nazil olmamışdır. Bu haqda bir adam[3] yalnız öz fikrini söyləmişdir." (əl-Buxari, 4518)

---

[1] "əl-Bəqərə" surəsi, 143.
[2] "əl-Bəqərə" surəsi, 196.
[3] 798-ci hədisin qeydlərinə bax..

## ١١– باب: قَوْلُهُ تَعَالَى: ﴿ ثُمَّ أَفِيضُواْ مِنْ حَيْثُ أَفَاضَ ٱلنَّاسُ ﴾

## 11-ci fəsil. Uca Allahın: "Sonra insanların axışıb gəldiyi yerdən siz də gəlin"[1] sözü

١٧١٤ – عَنْ عَائِشَةَ ﵂، كَانَتْ قُرَيْشٌ وَمَنْ دَانَ دِينَهَا يَقِفُونَ بِالْمُزْدَلِفَةِ وَكَانُوا يُسَمَّوْنَ الْحُمْسَ وَكَانَ سَائِرُ الْعَرَبِ يَقِفُونَ بِعَرَفَاتٍ فَلَمَّا جَاءَ الإِسْلاَمُ أَمَرَ اللَّهُ نَبِيَّهُ ﷺ أَنْ يَأْتِيَ عَرَفَاتٍ ثُمَّ يَقِفَ بِهَا ثُمَّ يُفِيضَ مِنْهَا فَذَلِكَ قَوْلُهُ تَعَالَى: ﴿ ثُمَّ أَفِيضُواْ مِنْ حَيْثُ أَفَاضَ ٱلنَّاسُ ﴾ [رواه البخاري: ٤٥٢٠]

**1714.** Aişə ﵂ rəvayət etmişdir ki, cahiliyyət dövründə əhməsilər – qureyşlilər və onların dinində olanlar[2] – (ziyarət əsnasında) Müzdəlifədə, digər ərəblər isə Ərəfatda dayanardılar. İslam dini gəldikdən sonra Allah Öz peyğəmbərinə ﷺ əmr etdi ki, əvvəlcə Ərəfata getsin, sonra Müzdəlifədə dayansın, daha sonra oradan çıxıb (Minaya) getsin. Bu haqda Uca Allahın ayəsində belə deyilir: **"Sonra insanların axışıb gəldiyi yerdən siz də gəlin."** (əl-Buxari, 4520)

## ١٢– باب: قَوْلُهُ تَعَالَى:
## ﴿ وَمِنْهُم مَّن يَقُولُ رَبَّنَآ ءَاتِنَا فِى ٱلدُّنْيَا حَسَنَةً وَفِى ٱلْأَخِرَةِ حَسَنَةً وَقِنَا عَذَابَ ٱلنَّارِ ﴾

## 12-ci fəsil. Uca Allahın: "Onlardan: "Ey Rəbbimiz! Bizə həm *bu* dünyada, həm də axirətdə gözəl nemətlər ver və bizi Od əzabından qoru!"– deyənləri də vardır"[3] sözü

١٧١٥ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ يَقُولُ: اللَّهُمَّ رَبَّنَا آتِنَا فِي الدُّنْيَا حَسَنَةً وَفِي الآخِرَةِ حَسَنَةً وَقِنَا عَذَابَ النَّارِ. [رواه البخاري: ٤٥٢٢]

**1715.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (çox vaxt dua edib) deyərdi: "Ey Allahım! Ey Rəbbimiz! Bizə həm bu dünyada, həm də axirətdə gözəl nemətlər ver və bizi Od əzabından qoru!" (əl-Buxari, 4522)

## ١٣– باب: قَوْلُهُ تَعَالَى: ﴿ لَا يَسْـَٔلُونَ ٱلنَّاسَ إِلْحَافًا ﴾

## 13-cü fəsil. Uca Allahın: "...*Bu adamlar* həya edib dilənmədiklərinə görə tanımayan adam onları varlı hesab edir..."[4] sözü

١٧١٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: لَيْسَ الْمِسْكِينُ الَّذِي تَرُدُّهُ التَّمْرَةُ وَالتَّمْرَتَانِ وَلاَ اللُّقْمَةُ وَلاَ اللُّقْمَتَانِ إِنَّمَا الْمِسْكِينُ الَّذِي يَتَعَفَّفُ وَاقْرَءُوا إِنْ شِئْتُمْ يَعْنِي قَوْلَهُ: ﴿ لَا يَسْـَٔلُونَ ٱلنَّاسَ إِلْحَافًا ﴾. [رواه البخاري: ٤٥٣٩]

---

[1] "əl-Bəqərə" surəsi, 199.
[2] Burada Xuzaə, Amir ibn Səsəa və Kinanə qəbilələri nəzərdə tutulur.
[3] "əl-Bəqərə" surəsi, 201.
[4] "əl-Bəqərə" surəsi, 273.

**1716.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(İnsanlar arasında gəzib-dolaşıb) bir-iki loxma və ya bir-iki xurma ilə kifayətlənən adam heç də yoxsul deyildir." Yoxsul o adamdır ki, (onun özünə bəs edəcək qədər malı olmaz, vəziyyətinin ağır olduğunu heç kəsə bildirməz və buna görə də ona sədəqə verilməz, özü də) həya edib insanlardan heç bir şey istəməz. İstəyirsinizsə, Allahın bu ayəsini oxuyun: "...*Bu adamlar* həya edib dilənmədiklərinə görə tanımayan adam onları varlı hesab edir..." (əl-Buxari, 4539)

# سُورَةُ آلِ عِمْرَانَ

# Ali-İmran surəsi

## ١٤ – باب:

قَوْلُهُ تَعَالَى: ﴿ٱللَّهِ ۚ فَإِن تَعْلَمُوٓاْ ءَابَآءَهُمْ فَإِخْوَٰنُكُمْ ٱلدِّينِ﴾

## 14-cü fəsil.
## Uca Allahın: "O Kitabın bir qismi mənası aydın ayələrdir ki, bunlar da Kitabın anasıdır. Digərləri isə mənası aydın olmayan ayələrdir..."[1] sözü

١٨١٧ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: تَلاَ رَسُولُ اللَّهِ ﷺ هَذِهِ الآيَةَ: ﴿ٱدْعُوهُمْ لِءَابَآئِهِمْ هُوَ أَقْسَطُ عِندَ ٱللَّهِ ۚ فَإِن تَعْلَمُوٓاْ ءَابَآءَهُمْ فَإِخْوَٰنُكُمْ فِى ٱلدِّينِ وَمَوَٰلِيكُمْ ۚ وَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ فِيمَآ أَخْطَأْتُم بِهِۦ وَلَٰكِن مَّا تَعَمَّدَتْ قُلُوبُكُمْ ۚ وَكَانَ ٱللَّهُ غَفُورًا رَّحِيمًا ۝٥ ٱلنَّبِىُّ أَوْلَىٰ بِٱلْمُؤْمِنِينَ مِنْ أَنفُسِهِمْ ۖ وَأَزْوَٰجُهُۥٓ أُمَّهَٰتُهُمْ ۗ وَأُوْلُواْ ٱلْأَرْحَامِ بَعْضُهُمْ أَوْلَىٰ بِبَعْضٍ فِى كِتَٰبِ ٱللَّهِ مِنَ﴾ قَالَتْ: قَالَ رَسُولُ اللَّهِ ﷺ فَإِذَا رَأَيْتِ الَّذِينَ يَتَّبِعُونَ مَا تَشَابَهَ مِنْهُ فَأُولَئِكَ الَّذِينَ سَمَّى اللَّهُ فَاحْذَرُوهُمْ. [رواه البخاري: ٤٥٤٧]

**1717.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ bu ayəni oxudu: **"Kitabı sənə nazil edən Odur. O Kitabın bir qismi mənası aydın ayələrdir ki, bunlar da Kitabın anasıdır. Digərləri isə mənası aydın olmayan ayələrdir. Qəlblərində əyrilik olanlar fitnə-fəsad törətmək və istədikləri kimi yozmaq məqsədilə mənası aydın olmayanın ardınca düşərlər. Onun yozumunu isə Allahdan başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə deyərlər: "Biz onlara iman gətirdik, hamısı bizim Rəbbimizdəndir". Bunu isə ancaq ağıl sahibləri dərk edərlər."** Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ (mənə) dedi: "Əgər mənası aydın olmayan (ayələrin) ardınca düşənləri görsən, (bil ki,) bunlar Allahın (ayədə) adlandırdığı kimsələrdir, onlardan uzaq ol!" (əl-Buxari, 4547)

[1] "Ali-İmran" surəsi, 7.

## ١٥– باب: قَوْلُهُ تَعَالَى:

﴿ إِنَّ ٱلَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ ٱللَّهِ وَأَيْمَـٰنِهِمْ ثَمَنًا قَلِيلًا أُوْلَـٰٓئِكَ لَا خَلَـٰقَ لَهُمْ فِى ٱلْـَٔاخِرَةِ ﴾

## 15-ci fəsil.
## Uca Allahın: "Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur"[1] sözü

١٧١٨ – عَنْ ابْنِ أَبِي مُلَيْكَةَ، أَنَّ امْرَأَتَيْنِ كَانَتَا تَخرزَان فِي بَيْت أَوْ فِي الْحُجْرَة فَخَرَجَتْ إِحْدَاهُمَا وَقَدْ أُنْفذَ بإِشْفَى فِي كَفِّهَا فَادَّعَتْ عَلَى الْأُخْرَى فَرُفعَ إِلَى ابْنِ عَبَّاسٍ فَقَالَ ابْنُ عَبَّاسٍ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لَوْ يُعْطَى النَّاسُ بدَعْوَاهُمْ لذَهَبَ دمَاءُ قَوْمٍ وَأَمْوَالُهُمْ ذَكِّرُوهَا باللَّه وَاقْرَءُوا عَلَيْهَا: ﴿ إِنَّ ٱلَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ ٱللَّهِ ﴾ فَذَكَّرُوهَا فَاعْتَرَفَتْ فَقَالَ ابْنُ عَبَّاسٍ قَالَ النَّبِيُّ ﷺ الْيَمِينُ عَلَى الْمُدَّعَى عَلَيْه. [رواه البخاري: ٤٥٥٢]

**1718.** İbn Əbu Muleykə rəvayət etmişdir ki, (bir dəfə) iki qadın bir evdə (və ya bir otaqda) biz ilə dəridən çarıq tikirdilər. Bu vaxt onlardan biri əlinə biz batmış halda bayıra çıxdı və bizi o biri qadının onun əlinə batırdığını iddia etdi. (Mübahisəni həll etmək üçün) ibn Abbasa müraciət edildikdə ibn Abbas dedi: "Peyğəmbər ﷺ demişdir: "Əgər insanlara onların iddia etdiklər (şeylər) verilsəydi, digərlərinin qanı və malı mənimsənilmiş olardı. İttiham edilən o qadına Allahı xatırladın və bu ayəni ona oxuyun: **"Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur..."** Qadına bunu xatırlatdılar, o da etiraz etdi.

(Hədisi danışan ravi) demişdir: "İbn Abbas ﵄ dedi: "Peyğəmbər ﷺ buyurmuşdur: "İttiham edilən şəxs and içməlidir.[2]" (əl-Buxari, 4552)

## ١٦– باب: قَوْلُهُ تَعَالَى: ﴿ إِنَّ ٱلنَّاسَ قَدْ جَمَعُوا۟ لَكُمْ فَٱخْشَوْهُمْ ﴾

## 16-cı fəsil. Uca Allahın: "Camaat sizə qarşı *ordu* toplayıbdır, onlardan qorxun!"[3] sözü

١٧١٩ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ قَالَ: ﴿ حَسْبُنَا ٱللَّهُ وَنِعْمَ ٱلْوَكِيلُ ﴾ قَالَهَا إِبْرَاهِيمُ ﵇ حِينَ أُلْقِيَ فِي النَّارِ وَقَالَهَا مُحَمَّدٌ ﷺ حِينَ قَالُوا: ﴿ إِنَّ ٱلنَّاسَ قَدْ جَمَعُوا۟ لَكُمْ فَٱخْشَوْهُمْ فَزَادَهُمْ إِيمَـٰنًا وَقَالُوا۟ حَسْبُنَا ٱللَّهُ وَنِعْمَ ٱلْوَكِيلُ ﴾ [رواه البخاري: ٤٥٦٣]

---

[1] "Ali-İmran" surəsi, 77.

[2] Abdullah ibn Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim bir müsəlmanı malından məhrum etmək üçün and içsə, Allahın hüzurunda olduğu zaman Allahın ona qəzəbi tutar". Uca Allah bu ayəni nazil etdi: "Həqiqətən də, Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kəslər üçün axirətdə heç bir pay yoxdur." Bu dəmdə Əşəs ibn Qeys ﵁ gəlib dedi: "Əbu Abdur-Rəhman sizə rəvayət etdiyi bu hadisə mənə aiddir, bu ayə mənə görə nazil olmuşdur. Belə ki, əmim oğlunun torpaq sahəsində mənə məxsus bir su quyusu var idi. (Aramızda mübahisə düşdükdə) Peyğəmbər ﷺ mənə: "Şahidlərini gətir!"– dedi. Mən: "Şahidim yoxdur"– dedim. Peyğəmbər ﷺ əmim oğlundan and içməyi tələb etdikdə, mən dedim: "Ya Rəsulullah, onun üçün heç bir təfavütü yoxdur. O, and içə bilər." Onda Peyğəmbər ﷺ dedi: "Kim bir müsəlmanı malından məhrum etmək üçün and içsə, Allahın hüzurunda olduğu zaman Allahın ona qəzəbi tutar." Uca Allah da onun dediklərini təsdiq etmək üçün bu ayəni nazil etdi." (Səhih əl-Buxari, 4250)

[3] "Ali-İmran" surəsi, 173.

**1719.** Rəvayət edilir ki, ibn Abbas ﵄ demişdir: **"Allah bizə yetər. O nə gözəl Qoruyandır!"**– sözlərini İbrahim ﵇ oda atıldığı zaman demişdir. Bu sözü həmçinin Peyğəmbər ﷺ (və onun səhabələri) demişlər. (O zaman ki): ***"Bəzi* adamlar onlara: "Camaat sizə qarşı *ordu* toplayıbdır, onlardan qorxun!"– dedilər. Bu, onların imanını daha da artırdı və onlar: "Allah bizə yetər. O nə gözəl Qoruyandır!"**– dedilər." (əl-Buxari, 4563)

## ١٧– باب: قَوْلُهُ تَعَالَى:

## ﴿وَلَتَسْمَعُنَّ مِنَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ مِن قَبْلِكُمْ وَمِنَ ٱلَّذِينَ أَشْرَكُوٓا۟ أَذًى كَثِيرًا﴾

## 17-ci fəsil. Uca Allahın: "Sizdən əvvəl Kitab verilənlərdən və müşriklərdən bir çox əziyyətverici sözlər eşidəcəksiniz"[1] sözü

١٧٢٠ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ﵄، أَنَّ رَسُولَ اللَّهِ ﷺ رَكِبَ عَلَى حِمَارٍ عَلَى قَطِيفَةٍ فَدَكِيَّةٍ وَأَرْدَفَ أُسَامَةَ بْنَ زَيْدٍ وَرَاءَهُ يَعُودُ سَعْدَ بْنَ عُبَادَةَ فِي بَنِي الْحَارِثِ بْنِ الْخَزْرَجِ قَبْلَ وَقْعَةِ بَدْرٍ قَالَ حَتَّى مَرَّ بِمَجْلِسٍ فِيهِ عَبْدُ اللَّهِ بْنُ أُبَيٍّ ابْنُ سَلُولَ وَذَلِكَ قَبْلَ أَنْ يُسْلِمَ عَبْدُ اللَّهِ بْنُ أُبَيٍّ فَإِذَا فِي الْمَجْلِسِ أَخْلاَطٌ مِنْ الْمُسْلِمِينَ وَالْمُشْرِكِينَ عَبَدَةِ الأَوْثَانِ وَالْيَهُودِ وَالْمُسْلِمِينَ وَفِي الْمَجْلِسِ عَبْدُ اللَّهِ بْنُ رَوَاحَةَ فَلَمَّا غَشِيَتْ الْمَجْلِسَ عَجَاجَةُ الدَّابَّةِ خَمَّرَ عَبْدُ اللَّهِ بْنُ أُبَيٍّ أَنْفَهُ بِرِدَائِهِ ثُمَّ قَالَ لاَ تُغَبِّرُوا عَلَيْنَا فَسَلَّمَ رَسُولُ اللَّهِ ﷺ عَلَيْهِمْ ثُمَّ وَقَفَ فَنَزَلَ فَدَعَاهُمْ إِلَى اللَّهِ وَقَرَأَ عَلَيْهِمْ الْقُرْآنَ فَقَالَ عَبْدُ اللَّهِ بْنُ أُبَيٍّ ابْنُ سَلُولَ أَيُّهَا الْمَرْءُ إِنَّهُ لاَ أَحْسَنَ مِمَّا تَقُولُ إِنْ كَانَ حَقًّا فَلاَ تُؤْذِنَا بِهِ فِي مَجْلِسِنَا ارْجِعْ إِلَى رَحْلِكَ فَمَنْ جَاءَكَ فَاقْصُصْ عَلَيْهِ فَقَالَ عَبْدُ اللَّهِ بْنُ رَوَاحَةَ بَلَى يَا رَسُولَ اللَّهِ فَاغْشَنَا بِهِ فِي مَجَالِسِنَا فَإِنَّا نُحِبُّ ذَلِكَ فَاسْتَبَّ الْمُسْلِمُونَ وَالْمُشْرِكُونَ وَالْيَهُودُ حَتَّى كَادُوا يَتَثَاوَرُونَ فَلَمْ يَزَلْ النَّبِيُّ ﷺ يُخَفِّضُهُمْ حَتَّى سَكَنُوا ثُمَّ رَكِبَ النَّبِيُّ ﷺ دَابَّتَهُ فَسَارَ حَتَّى دَخَلَ عَلَى سَعْدِ بْنِ عُبَادَةَ فَقَالَ لَهُ النَّبِيُّ ﷺ يَا سَعْدُ أَلَمْ تَسْمَعْ مَا قَالَ أَبُو حُبَابٍ يُرِيدُ عَبْدَ اللَّهِ بْنَ أُبَيٍّ قَالَ كَذَا وَكَذَا قَالَ سَعْدُ بْنُ عُبَادَةَ يَا رَسُولَ اللَّهِ اعْفُ عَنْهُ وَاصْفَحْ عَنْهُ فَوَالَّذِي أَنْزَلَ عَلَيْكَ الْكِتَابَ لَقَدْ جَاءَ اللَّهُ بِالْحَقِّ الَّذِي أَنْزَلَ عَلَيْكَ لَقَدْ اصْطَلَحَ أَهْلُ هَذِهِ الْبُحَيْرَةِ عَلَى أَنْ يُتَوِّجُوهُ فَيُعَصِّبُوهُ بِالْعِصَابَةِ فَلَمَّا أَبَى اللَّهُ ذَلِكَ بِالْحَقِّ الَّذِي أَعْطَاكَ اللَّهُ شَرِقَ بِذَلِكَ فَذَلِكَ فَعَلَ بِهِ مَا رَأَيْتَ فَعَفَا عَنْهُ رَسُولُ اللَّهِ ﷺ وَكَانَ النَّبِيُّ ﷺ وَأَصْحَابُهُ يَعْفُونَ عَنْ الْمُشْرِكِينَ وَأَهْلِ الْكِتَابِ كَمَا أَمَرَهُمْ اللَّهُ وَيَصْبِرُونَ عَلَى الأَذَى قَالَ اللَّهُ عَزَّ وَجَلَّ: ﴿وَلَتَسْمَعُنَّ مِنَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ مِن قَبْلِكُمْ وَمِنَ ٱلَّذِينَ أَشْرَكُوٓا۟ أَذًى كَثِيرًا﴾ الآيَةَ وَقَالَ اللَّهُ: ﴿وَدَّ كَثِيرٌ مِّنْ أَهْلِ ٱلْكِتَٰبِ لَوْ يَرُدُّونَكُم مِّنۢ بَعْدِ إِيمَٰنِكُمْ كُفَّارًا حَسَدًا مِّنْ عِندِ أَنفُسِهِم﴾ إِلَى آخِرِ الآيَةِ. وَكَانَ النَّبِيُّ ﷺ يَتَأَوَّلُ الْعَفْوَ مَا أَمَرَهُ اللَّهُ بِهِ حَتَّى أَذِنَ اللَّهُ فِيهِمْ فَلَمَّا غَزَا رَسُولُ اللَّهِ ﷺ بَدْرًا فَقَتَلَ اللَّهُ بِهِ صَنَادِيدَ كُفَّارِ قُرَيْشٍ قَالَ ابْنُ أُبَيٍّ ابْنُ سَلُولَ وَمَنْ مَعَهُ مِنْ الْمُشْرِكِينَ وَعَبَدَةِ الأَوْثَانِ هَذَا أَمْرٌ قَدْ تَوَجَّهَ فَبَايِعُوا الرَّسُولَ ﷺ عَلَى الإِسْلاَمِ فَأَسْلَمُوا. [رواه البخاري: ٤٥٦٣]

**1720.** Usamə ibn Zeyddən ﵄ rəvayət edilmişdir ki, hələ Bədr döyüşündən əvvəl Peyğəmbər ﷺ üstünə Fədəkdə hazırlanmış palan qoyulmuş uzunqulağına minib, Usaməni də tərkinə alıb Bəni Haris ibn Xəzrəc qəbiləsindəki Səd ibn Ubadəni ziyarət etdi. Yolda Peyğəmbər ﷺ Abdullah ibn Ubey ibn Səlulun olduğu bir məclisin yanından keçdi. O vaxt Abdullah ibn Ubey ibn Səlul hə-

[1] "Ali-İmran" surəsi, 186.

lə İslamı qəbul etməmişdi. Bu məclisdə həm müsəlmanlar, həm Allaha şərik qoşan bütpərəstlər, həm də yəhudilər iştirak edirdilər. Abdulla ibn Rəvaha da həmin məclisdə idi. Uzunqulağın qaldırdığı tozanaq, məclisi bürüdükdə Abdullah ibn Ubey ibn Səlul bürüncəyi ilə burnunu tutub: "Bizi tozlamayın!"– dedi. Peyğəmbər ﷺ onlara salam verib dayandı, sonra (uzunqulaqdan) düşüb onları Allahın (dininə) dəvət etdi və onlara Quran oxudu. Abdullah ibn Ubey ibn Səlul dedi: "Ay adam, əgər sənin dediklərin doğrudursa, demək, bundan gözəl şey yoxdur. Ancaq məclisimizdə belə şeylərlə bizə əziyyət vermə, get otur yerində və belə şeyləri sənin yanına gələn adamlara danış." Bu vaxt Abdulla ibn Rəvaha dedi: "Fikir vermə, ey Allahın Rəsulu, sən məclislərimizdə bizə Qurandan danış, biz onu (dinləməyi çox) sevirik." (Bu vaxt ara qarışdı) müsəlmanlar, müşriklər və yəhudilər bir-birilərinə nalayiq sözlər söyləməyə başladılar və iş o yerə gəlib çatdı ki, onlar az qala vuruşacaqdılar. Peyğəmbər ﷺ onları sakitləşdirməyə başladı. Haçandan-haçana onlar sakitləşdilər. Bundan sonra Peyğəmbər ﷺ uzunqulağına minib yoluna davam etdi. Nəhayət, gəlib Səd ibn Ubadənin ؓ (evinə) daxil oldu və dedi: "Ey Səd, sən Əbu Hubabın nə dediyini eşitmədinmi? O, belə-belə dedi." (Peyğəmbər ﷺ Əbu Hubab deyəndə) Abdullah ibn Ubey ibn Səlulu qəsd edirdi. Səd ibn Ubadə ؓ dedi: "Ey Allahın elçisi, onu əfv et, onun təqsirindən keç. Kitabı sənə nazil edən Allaha and olsun ki, Allah səni, sənə nazil etdiyi haqq ilə göndərdi. Halbuki (bir az əvvəl) bu şəhərin[1] əhalisi (Abdullah ibn Ubeyin) yanına gedib onun başına əmmamə qoymağa razılıq vermişdilər[2]. Allah sənə bəxş etdiyi haqq sayəsində bu işi alt-üst etdikdə isə, (Abdullahın) buna paxıllığı tutdu. Elə bu da onu gördüyün belə bir işi tutmağa vadar etdi." Beləliklə, Peyğəmbər ﷺ onu bağışladı. Peyğəmbər ﷺ və onun əshabələri Allahın əmr etdiyi kimi müşrikləri və Kitab əhlini əfv edər və (özlərinə verilən) əziyyətlərə səbir edərdilər. Qüdrətli və əzəmətli Allah buyurur: **"Siz hökmən malınız və canınızla sınaqdan keçiriləcəksiniz. Sizdən əvvəl Kitab verilənlərdən və müşriklərdən bir çox əziyyətverici sözlər eşidəcəksiniz. Əgər səbir edib *Allahdan* qorxsanız, *bilin ki,* bu, əzmkarlıq *tələb edən* əməllərdəndir."** Həmçinin, Allah buyurur: **"Kitab əhlindən bir çoxu həqiqəti bildikdən sonra da, paxıllıqları üzündən sizi, siz iman gətirdikdən sonra kafirliyə qaytarmaq istəyərlər. Allah Öz əmri ilə gəlincəyə qədər *onları* bağışlayın və *onlara* baş qoşmayın! Həqiqətən, Allah hər şeyə qadirdir"[3].** Peyğəmbər ﷺ Allahın (kafirləri) bağışlamağa dair əmrini olduğu kimi yozurdu[4]. Nəhayət, Allah (Öz peyğəmbərinə ﷺ) onlarla vuruşmağa izn verdi. Bədr döyüşündə Peyğəmbər ﷺ Qureyşin adlı-sanlı kafirlərini öldürdükdə Abdullah ibn Ubey ibn Səlul, habelə onun yanındakı müşriklər və bütpərəstlər: "Bu iş qarşısıalınmazdır[5]. Haydı Rəsulullaha ﷺ beyət edin!"– dedilər və İslamı qəbul etdilər.[6]" (əl-Buxari, 4566)

---

[1] Burada Mədinə şəhəri qəsd edilir.
[2] Yəni onu başçı seçmək istəyirdilər.
[3] "əl-Bəqərə" surəsi, 109.
[4] Yəni onların təqsirlərindən keçirdi.
[5] Yəni İslam dininin yayılmasının qarşısını heç kəs ala bilməz. [Həqiqətən də, bu din yayılıb, yayılır və yayılacaq da. Uca Allah buyurur: **"Onlar ağızları ilə Allahın nurunu söndürmək istəyirlər. Allah isə *buna* yol verməz, kafirlərin xoşuna gəlməsə də, O, Öz nurunu tamamlayar."** "ət-Tovbə" surəsi, 32.]
[6] Abdullah ibn Ubey ibn Səlul başda olmaqla münafiqlər yalnız zahirən müsəlman oldular.

## ١٨- باب: قَوْلُهُ تَعَالَى: ﴿لَا تَحْسَبَنَّ ٱلَّذِينَ يَفْرَحُونَ بِمَآ أَتَوا۟﴾

## 18-ci fəsil.
## Uca Allahın: "Törətdikləri əməllərdən fərəhlənən və etmədikləri işlərə görə tərif olunmağı xoşlayan kimsələrin əzabdan qurtulacaqlarını əsla güman etmə..."[1] sözü

١٧٢١ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ، أَنَّ رِجَالاً مِنَ الْمُنَافِقِينَ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ كَانَ إِذَا خَرَجَ رَسُولُ اللَّهِ ﷺ إِلَى الْغَزْوِ تَخَلَّفُوا عَنْهُ وَفَرِحُوا بِمَقْعَدِهِمْ خِلاَفَ رَسُولِ اللَّهِ ﷺ فَإِذَا قَدِمَ رَسُولُ اللَّهِ ﷺ اعْتَذَرُوا إِلَيْهِ وَحَلَفُوا وَأَحَبُّوا أَنْ يُحْمَدُوا بِمَا لَمْ يَفْعَلُوا فَنَزَلَتْ: ﴿لَا تَحْسَبَنَّ ٱلَّذِينَ يَفْرَحُونَ بِمَآ أَتَوا۟ وَّيُحِبُّونَ أَن يُحْمَدُوا۟ بِمَا لَمْ يَفْعَلُوا۟﴾ الآيَةَ. [رواه البخاري: ٤٥٦٧]

**1721.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ dövründə Peyğəmbər ﷺ döyüşə çıxdıqda münafiqlərdən bəziləri ondan ayrılar və döyüşə getməyib Peyğəmbərə ﷺ müxalif olduqlarına sevinərdilər. Peyğəmbər ﷺ döyüşdən qayıtdıqda isə özlərinə bəraət qazandırmaq üçün bəhanələr gətirər və and içərdilər. Üstəlik, görmədikləri işlərə görə tərif olunmağı sevərdilər. (Elə buna görə də) bu ayə nazil oldu: **"Törətdikləri əməllərdən fərəhlənən və etmədikləri işlərə görə tərif olunmağı xoşlayan kimsələrin əzabdan qurtulacaqlarını əsla güman etmə. Onlara acılı-ağrılı bir əzab hazırlanmışdır."** (əl-Buxari, 4567)

١٧٢٢ – عَنْ عَلْقَمَةَ بْنَ وَقَّاصٍ، أَنَّ مَرْوَانَ قَالَ لِبَوَّابِهِ: اذْهَبْ يَا رَافِعُ إِلَى ابْنِ عَبَّاسٍ فَقُلْ لَئِنْ كَانَ كُلُّ امْرِئٍ فَرِحَ بِمَا أُوتِيَ وَأَحَبَّ أَنْ يُحْمَدَ بِمَا لَمْ يَفْعَلْ مُعَذَّبًا لَنُعَذَّبَنَّ أَجْمَعُونَ فَقَالَ ابْنُ عَبَّاسٍ وَمَا لَكُمْ وَلِهَذِهِ إِنَّمَا دَعَا النَّبِيُّ ﷺ يَهُودَ فَسَأَلَهُمْ عَنْ شَيْءٍ فَكَتَمُوهُ إِيَّاهُ وَأَخْبَرُوهُ بِغَيْرِهِ فَأَرَوْهُ أَنْ قَدِ اسْتَحْمَدُوا إِلَيْهِ بِمَا أَخْبَرُوهُ عَنْهُ فِيمَا سَأَلَهُمْ وَفَرِحُوا بِمَا أُوتُوا مِنْ كِتْمَانِهِمْ ثُمَّ قَرَأَ ابْنُ عَبَّاسٍ: ﴿وَإِذْ أَخَذَ ٱللَّهُ مِيثَٰقَ ٱلَّذِينَ أُوتُوا۟ ٱلْكِتَٰبَ﴾ حَتَّى قَوْلِهِ ﴿يَفْرَحُونَ بِمَآ أَتَوا۟ وَّيُحِبُّونَ أَن يُحْمَدُوا۟ بِمَا لَمْ يَفْعَلُوا۟﴾ الآيَةَ. [رواه البخاري: ٤٥٦٨]

**1722.** Əlqəmə ibn Vəqqas rəvayət edir ki, bir dəfə Mərvan ibn Həkəm qapıda duran gözətçilərdən birinə: "Ey Rafi, get, ibn Abbasdan soruş ki, törətdikləri əməllərdən fərəhlənən və etmədikləri işlərə görə tərif olunmağı xoşlayan hər bir kəsə əzab veriləcəkmi?" İbn Abbas dedi: "Bu ayənin sizə nə aidiyyəti var ki?! İş burasındadır ki, Peyğəmbər ﷺ bir dəstə yəhudini çağırıb onlardan bir məsələ barəsində soruşduqda, onlar həqiqəti gizlədib, ona başqa cavabı verdilər. Onlar belə cavab verməklə tərif olunmaq istədilər, həm də həqiqəti gizlətdiklərinə görə sevindilər." Sonra ibn Abbas bu ayələri oxudu: **"O zaman Allah Kitab verilənlərlə əhd bağlayıb: "Siz o *Kitabı* mütləq insanlara aydınlaşdıracaqsınız və onu gizlətməyəcəksiniz!"– deyə buyurdu. Onlar isə bu əhdi qulaqardına vurub, onu ucuz qiymətə satdılar. Onların bu alveri necə də pisdir! Törətdikləri əməllərdən fərəhlənən və etmədikləri işlərə görə tərif olunmağı xoşlayan kimsələrin əzabdan qurtulacaqlarını əsla güman etmə. Onlara acılı-ağrılı bir əzab hazırlanmışdır."**[2] (əl-Buxari, 4568)

---

[1] "Ali-İmran" surəsi, 188.
[2] "Ali-İmran" surəsi, 187-188.

# سُورَةُ النِّسَاءِ

# ən-Nisa surəsi

## ١٩ – باب: قَوْلُهُ تَعَالَى: ﴿ وَإِنْ خِفْتُمْ أَلَّا تُقْسِطُوا فِي الْيَتَامَىٰ ﴾

## 19-cu fəsil. Uca Allahın: "Yetim qızlara qarşı ədalətli olmayacağınızdan qorxursunuzsa,..."[1] sözü

١٧٢٣ – عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ أَنَّهُ سَأَلَ عَائِشَةَ رضي الله عنها عَنْ قَوْلِ اللَّهِ تَعَالَى: ﴿ وَإِنْ خِفْتُمْ أَلَّا تُقْسِطُوا فِي الْيَتَامَىٰ ﴾ فَقَالَتْ: يَا ابْنَ أُخْتِي هَذِهِ الْيَتِيمَةُ تَكُونُ فِي حَجْرِ وَلِيِّهَا تَشْرَكُهُ فِي مَالِهِ وَيُعْجِبُهُ مَالُهَا وَجَمَالُهَا فَيُرِيدُ وَلِيُّهَا أَنْ يَتَزَوَّجَهَا بِغَيْرِ أَنْ يُقْسِطَ فِي صَدَاقِهَا فَيُعْطِيَهَا مِثْلَ مَا يُعْطِيهَا غَيْرُهُ فَنُهُوا عَنْ أَنْ يَنْكِحُوهُنَّ إِلاَّ أَنْ يُقْسِطُوا لَهُنَّ وَيَبْلُغُوا لَهُنَّ أَعْلَى سُنَّتِهِنَّ فِي الصَّدَاقِ فَأُمِرُوا أَنْ يَنْكِحُوا مَا طَابَ لَهُمْ مِنَ النِّسَاءِ سِوَاهُنَّ قَالَ عُرْوَةُ قَالَتْ عَائِشَةُ وَإِنَّ النَّاسَ اسْتَفْتَوْا رَسُولَ اللَّهِ ﷺ بَعْدَ هَذِهِ الآيَةِ فَأَنْزَلَ اللَّهُ: ﴿ وَيَسْتَفْتُونَكَ فِي النِّسَاءِ ﴾ قَالَتْ عَائِشَةُ: وَقَوْلُ اللَّهِ تَعَالَى فِي آيَةٍ أُخْرَى: ﴿ وَتَرْغَبُونَ أَنْ تَنْكِحُوهُنَّ ﴾ رَغْبَةُ أَحَدِكُمْ عَنْ يَتِيمَتِهِ حِينَ تَكُونُ قَلِيلَةَ الْمَالِ وَالْجَمَالِ قَالَتْ فَنُهُوا أَنْ يَنْكِحُوا عَنْ مَنْ رَغِبُوا فِي مَالِهِ وَجَمَالِهِ فِي يَتَامَى النِّسَاءِ إِلاَّ بِالْقِسْطِ مِنْ أَجْلِ رَغْبَتِهِمْ عَنْهُنَّ إِذَا كُنَّ قَلِيلاَتِ الْمَالِ وَالْجَمَالِ. [رواه البخاري: ٤٥٤٧]

**1723.** Rəvayət edilir ki, Urva ibn Zubeyr Aişədən ﷺ Uca Allahın: **"Yetim qızlara qarşı ədalətli olmayacağınızdan qorxursunuzsa,..."** ayəsi barəsində soruşdu. Aişə dedi: "Bacı oğlu, bu (ayədə bəhs edilən) yetim qız hamisinin himayəsi altındadır və hamisi onun malına şərikdir. Özü də qızın həm malına, həm də özünə gözü düşüb. Hamisi onunla evlənmək istəyir, lakin onun mehrini insafla, (evlənmək istəyən) kimsənin (aldığı) qıza verdiyi kimi mehr verməkdən boyun qaçırır. Belələrinə yetim qızlarla evlənmək qadağan edilmişdir. Ancaq (mehr xüsusunda) ədalətlə hərəkət edərək və bu qızlara adətən qadınlara verilən mehrin ən yaxşısını verərək onlarla evlənə bilərlər. Əks təqdirdə onlara bu qızlardan başqa xoşlarına gələn (halal) qadınlarla evlənmək əmr olunur."

Urva rəvayət edir ki, Aişə demişdir: "Bu ayədən sonra insanlar Peyğəmbərdən ﷺ qadınlar barəsində fətva istədilər və Allah (bu ayəni) nazil etdi: **"Səndən qadınlar barəsində hökm *verməyini* istəyirlər..."[2]** Aişə (davam edib) dedi: "Bu ayənin davamında: **"evlənmək istədiyiniz"** sözü, birinizin, himayəsi altında olan, malı az olub özü də çox gözəl olmayan yetim qızla evlənmək istəyi olmadığı mənasını verir. Odur ki, (kişilərə) himayələrində olan yetim qızların malına və gözəlliyinə görə onlarla evlənmək qadağan edilmişdir. Çünki əgər bu qızların malı az olsaydı, özləri də gözəl olmasay-

---

[1] "ən-Nisa" surəsi, 3.

[2] "ən-Nisa" surəsi, 127. Ayənin tamamı: **"...De: "Onlar barəsində və *həmçinin* Kitabda sizə oxunan *ayələrdə* özlərinə müəyyən edilmiş *mirası* verməyərək evlənmək istədiyiniz yetim qızlar, zəif uşaqlar və yetimlərlə ədalətlə rəftar etməyiniz haqqında hökmü sizə Allah verir. Siz nə yaxşılıq edirsinizsə, şübhəsiz ki, Allah onu bilir."**

dılar, (bu himayədarlar) onlarla evlənməzdilər. Ancaq (mehr xüsusunda) ədalətlə hərəkət etsələr (onlarla) evlənə bilərlər." (əl-Buxari, 4574)

## ٢٠– باب: قَوْلُهُ تَعَالَى: ﴿ يُوصِيكُمُ ٱللَّهُ فِيٓ أَوۡلَٰدِكُمۡۖ ﴾

## 20-ci fəsil. Uca Allahın: "Allah övladlarınız haqqında sizə *belə* tövsiyə edir..."[1] sözü

١٧٢٤ – عَنْ جَابِرٍ ﷺ قَالَ: عَادَنِي النَّبِيُّ ﷺ وَأَبُو بَكْرٍ فِي بَنِي سَلِمَةَ مَاشِيَيْنِ فَوَجَدَنِي النَّبِيُّ ﷺ لاَ أَعْقِلُ شَيْئًا فَدَعَا بِمَاءٍ فَتَوَضَّأَ مِنْهُ ثُمَّ رَشَّ عَلَيَّ فَأَفَقْتُ فَقُلْتُ: مَا تَأْمُرُنِي أَنْ أَصْنَعَ فِي مَالِي يَا رَسُولَ اللَّهِ فَنَزَلَتْ: ﴿ يُوصِيكُمُ ٱللَّهُ فِيٓ أَوۡلَٰدِكُمۡۖ ﴾. [رواه البخاري: ٤٥٧٧]

**1724.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ və Əbu Bəkr mənə baş çəkmək üçün piyada Bəni Sələmə qəbiləsinə gəldilər. Peyğəmbər ﷺ məni (halsız və) heç nəyi dərk etmədiyim bir halda görüb (ev əhlindən) su gətirməyi tələb etdi. O, dəstəmaz aldıqdan və o sudan mənin üzümə səpdikdən sonra mən ayıldım və (ondan): "Malımı necə bölüşdürüm, ya Rəsulullah?"– deyə soruşdum. Allah da (bu ayəni) nazil etdi: **"Allah övladlarınız haqqında sizə *belə* tövsiyə edir..."** (əl-Buxari, 4577)

## ٢١– باب:
## قَوْلُهُ تَعَالَى: ﴿ إِنَّ ٱللَّهَ لَا يَظۡلِمُ مِثۡقَالَ ذَرَّةٖۖ ﴾

## 21-ci fəsil. Uca Allahın: "Həqiqətən, Allah zərrə qədər də olsa zülm etməz."[2] sözü

١٧٢٥ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ، أَنَّ أُنَاسًا فِي زَمَنِ النَّبِيِّ ﷺ قَالُوا يَا رَسُولَ اللَّهِ هَلْ نَرَى رَبَّنَا يَوْمَ الْقِيَامَةِ قَالَ النَّبِيُّ ﷺ نَعَمْ هَلْ تُضَارُّونَ فِي رُؤْيَةِ الشَّمْسِ بِالظَّهِيرَةِ ضَوْءٌ لَيْسَ فِيهَا سَحَابٌ قَالُوا لاَ قَالَ وَهَلْ تُضَارُّونَ فِي رُؤْيَةِ الْقَمَرِ لَيْلَةَ الْبَدْرِ ضَوْءٌ لَيْسَ فِيهَا سَحَابٌ قَالُوا لاَ قَالَ النَّبِيُّ ﷺ مَا تُضَارُونَ فِي رُؤْيَةِ اللَّهِ عَزَّ وَجَلَّ يَوْمَ الْقِيَامَةِ إِلاَّ كَمَا تُضَارُونَ فِي رُؤْيَةِ أَحَدِهِمَا إِذَا كَانَ يَوْمُ الْقِيَامَةِ أَذَّنَ مُؤَذِّنٌ تَتْبَعُ كُلُّ أُمَّةٍ مَا كَانَتْ تَعْبُدُ فَلاَ يَبْقَى مَنْ كَانَ يَعْبُدُ غَيْرَ اللَّهِ مِنْ الأَصْنَامِ وَالأَنْصَابِ إِلاَّ يَتَسَاقَطُونَ فِي النَّارِ حَتَّى إِذَا لَمْ يَبْقَ إِلاَّ مَنْ كَانَ يَعْبُدُ اللَّهَ بَرٌّ أَوْ فَاجِرٌ وَغُبَّرَاتُ أَهْلِ الْكِتَابِ فَيُدْعَى الْيَهُودُ فَيُقَالُ لَهُمْ مَنْ كُنْتُمْ تَعْبُدُونَ قَالُوا كُنَّا نَعْبُدُ عُزَيْرَ ابْنَ اللَّهِ

---

[1] "ən-Nisa" surəsi, 11. Ayənin tamamı: **"...kişiyə, iki qadının payı qədər *pay* düşür. Əgər *övladların hamısı* ikidən artıq sayda qadındırlarsa, *vəfat edənin* qoyub getdiyi *malın* üçdə iki hissəsi onlara çatır. Əgər təkcə bir qadındırsa, *mirasın* yarısı ona çatır. Əgər *ölənin* övladı varsa, onun valideynlərinin hər birinə qoyub getdiyi *malının* altıda bir hissəsi çatır. Əgər onun övladı yoxdursa, varisi də *ancaq* valideynləridirsə, onun anasına *mirasının* üçdə bir hissəsi düşür. Əgər *ölənin* qardaşları *və ya bacıları* varsa, onun anasına *mirasının* altıda bir hissəsi düşür. *Bu bölgü* ölənin vəsiyyəti yerinə yetirildikdən və ya borcu ödənildikdən sonra *aparılır*. Valideynlərinizdən və övladlarınızdan hansının fayda baxımından sizə daha yaxın olduğunu siz bilmirsiniz. *Bunlar* Allah tərəfindən buyurulmuş fərz əməllərdir. Həqiqətən, Allah Biləndir, Müdrikdir."**

[2] "ən-Nisa" surəsi, 40.

فَيُقَالُ لَهُمْ كَذَبْتُمْ مَا اتَّخَذَ اللَّهُ مِنْ صَاحِبَةٍ وَلاَ وَلَدٍ فَمَاذَا تَبْغُونَ فَقَالُوا عَطِشْنَا رَبَّنَا فَاسْقِنَا فَيُشَارُ أَلاَ تَرِدُونَ فَيُحْشَرُونَ إِلَى النَّارِ كَأَنَّهَا سَرَابٌ يَحْطِمُ بَعْضُهَا بَعْضًا فَيَتَسَاقَطُونَ فِي النَّارِ ثُمَّ يُدْعَى النَّصَارَى فَيُقَالُ لَهُمْ مَنْ كُنْتُمْ تَعْبُدُونَ قَالُوا كُنَّا نَعْبُدُ الْمَسِيحَ ابْنَ اللَّهِ فَيُقَالُ لَهُمْ كَذَبْتُمْ مَا اتَّخَذَ اللَّهُ مِنْ صَاحِبَةٍ وَلاَ وَلَدٍ فَيُقَالُ لَهُمْ مَاذَا تَبْغُونَ فَكَذَلِكَ مِثْلَ الأَوَّلِ حَتَّى إِذَا لَمْ يَبْقَ إِلاَّ مَنْ كَانَ يَعْبُدُ اللَّهَ مِنْ بَرٍّ أَوْ فَاجِرٍ أَتَاهُمْ رَبُّ الْعَالَمِينَ فِي أَدْنَى صُورَةٍ مِنَ الَّتِي رَأَوْهُ فِيهَا فَيُقَالُ مَاذَا تَنْتَظِرُونَ تَتْبَعُ كُلُّ أُمَّةٍ مَا كَانَتْ تَعْبُدُ قَالُوا فَارَقْنَا النَّاسَ فِي الدُّنْيَا عَلَى أَفْقَرِ مَا كُنَّا إِلَيْهِمْ وَلَمْ نُصَاحِبْهُمْ وَنَحْنُ نَنْتَظِرُ رَبَّنَا الَّذِي كُنَّا نَعْبُدُ فَيَقُولُ أَنَا رَبُّكُمْ فَيَقُولُونَ لاَ نُشْرِكُ بِاللَّهِ شَيْئًا مَرَّتَيْنِ أَوْ ثَلاَثًا. [رواه البخاري: ٤٥٨١]

**1725.** Əbu Səid əl-Xudri ﷺ rəvayət etmişdir ki, Peyğəmbərin ﷺ dövründə bir dəstə adam Peyğəmbərə ﷺ dedi: "Ya Rəsulullah, Qiyamət günü Rəbbimizi görə biləcəyikmi?" Peyğəmbər ﷺ dedi: "Bəli, məgər sizə günortaüstü, gün işığının qabağını bulud örtmədiyi bir vaxtda günəşi görməyinizə nəsə mane olurmu?" Onlar: "Xeyr!"– dedilər. (Peyğəmbər ﷺ) soruşdu: "Məgər sizə on dördüncü gecədə, ay işığının qabağını bulud örtmədiyi bir vaxtda ayı görməyinizə nəsə mane olurmu?" Onlar: "Xeyr!"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "Bu ikisini görməyə sizə heç bir şey mane olmadığı kimi, qüdrətli və əzəmətli Allahı da Qiyamət günü beləcə, görəcəksiniz. Qiyamət günü yetişdiyi zaman carçı səsləyib deyəcək: "Hər bir ümmət nəyə ibadət edirdisə, qoy onun ardınca getsin!" Bundan sonra Allahdan qeyrisinə – bütlərə və dikinə qoyulmuş daşlara ibadət edən elə bir kimsə qalmayacaq ki, Cəhənnəm oduna düşməsin. Axırda isə ancaq Allaha ibadət edənlər, – xeyirxah, yaxud günahkar adamlar, – habelə Kitab əhlindən (peyğəmbərlərinə sadiq qalmış kimsələr) qalacaqdır. (O vaxt) yəhudiləri çağırıb onlardan soruşacaqlar ki: "Siz nəyə ibadət edirdiniz?" Onlar deyəcəklər: "Biz Allahın oğlu Üzeyirə ibadət edirdik." Onlara deyiləcək: "Yalan danışırsınız, Allah Özünə nə zövcə, nə də övlad götürmüşdür. (Bir deyin görək) siz nə istəyirsiniz?" Onlar deyəcəklər: "Susamışıq, ey Rəbbimiz, bizə su ver." (Onda onlara Cəhənnəm) göstəriləcək (və deyiləcək): "(Bundan) içmək istəmirsinizmi?" Onlar ilğıma bənzər, alovlanan atəşin (kənarına) toplanacaq və Cəhənnəmə düşəcəklər. Sonra xristianları çağırıb onlardan soruşacaqlar ki: "Siz nəyə ibadət edirdiniz?" Onlar deyəcəklər: "Biz Allahın oğlu Məsihə[1] ibadət edirdik." Onlara deyiləcək: "Yalan danışırsınız, Allah Özünə nə zövcə, nə də övlad götürmüşdür." Sonra onlardan: "Siz nə istəyirsiniz?"– deyə soruşulacaq və beləliklə də, əvvəlkilərin başına gələnlər onların da başına gələcəkdir. Nəhayət, ancaq Allaha ibadət edən kimsələr – xeyirxah, yaxud günahkar adamlar qaldıqda, aləmlərin Rəbbi onların yanına bildikləri ən yaxın surətdə[2] gələcək. Sonra onlara deyiləcək: "Nə gözləyirsiniz?! Qoy hər bir ümmət ibadət etdiyi (məbudun) ardınca getsin!" Onlar deyəcəklər: "Biz dünyada ikən insanlara ehtiyacımız ola-ola onlardan ayrıldıq, əsla onlarla birlikdə olmadıq. İndi isə biz ibadət etdiyimiz Rəbbimizi gözləyirik." Onda Allah buyuracaq: "Mən sizin Rəbbinizəm!" Onlar iki və ya üç dəfə: "Biz heç nəyi Allaha şərik qoşmuruq!"- deyəcəklər." (əl-Buxari, 4581)

---

[1] Burada Məryəm oğlu İsa ﷺ nəzərdə tutulur.

[2] Yəni Allahın isim və sifətlərinə dair Quran və sünnədə varid olan dəlillərdən bildikləri vəsflərə uyğun surətdə gələcək.

## ٢٢- باب: قَوْلُهُ تَعَالَى:

﴿ فَكَيْفَ إِذَا جِئْنَا مِن كُلِّ أُمَّةٍ بِشَهِيدٍ وَجِئْنَا بِكَ عَلَىٰ هَٰٓؤُلَآءِ شَهِيدًا ﴾

## 22-ci fəsil. Uca Allahın: "Biz hər ümmətdən bir şahid gətirəcəyimiz və səni də onlara şahid gətirəcəyimiz zaman *onların halı* necə olacaq?"[1] sözü

١٧٢٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: قَالَ لِي النَّبِيُّ ﷺ: اقْرَأْ عَلَيَّ قُلْتُ: آقْرَأُ عَلَيْكَ وَعَلَيْكَ أُنْزِلَ؟ قَالَ: فَإِنِّي أُحِبُّ أَنْ أَسْمَعَهُ مِنْ غَيْرِي فَقَرَأْتُ عَلَيْهِ سُورَةَ النِّسَاءِ حَتَّى بَلَغْتُ: ﴿ فَكَيْفَ إِذَا جِئْنَا مِن كُلِّ أُمَّةٍ بِشَهِيدٍ وَجِئْنَا بِكَ عَلَىٰ هَٰٓؤُلَآءِ شَهِيدًا ﴾ قَالَ: أَمْسِكْ فَإِذَا عَيْنَاهُ تَذْرِفَانِ. [رواه البخاري: ٤٥٨٢]

**1726.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ mənə buyurdu ki: "Mənə Quran oxu!" Dedim: "(Ya Rəsulullah! Quran) sənə nazil olduğu halda, onu sənə mənmi oxuyacağam?" Peyğəmbər ﷺ dedi: "Bəli, mən onu başqasından dinləməyi xoşlayıram." Mən ona "ən-Nisa" surəsini oxumağa başladım. Nəhayət, (surənin): **"Biz hər ümmətdən bir şahid gətirəcəyimiz və səni də onlara şahid gətirəcəyimiz zaman *onların halı* necə olacaq?"** ayəsinə çatdıqda, Peyğəmbər ﷺ: "Dayan!"– dedi. Mən (başımı qaldırdıqda) Peyğəmbərin ﷺ gözlərinin yaşla dolduğunu gördüm" (əl-Buxari, 4582)

## ٢٣- باب: قَوْلُهُ تَعَالَى:

﴿ إِنَّ الَّذِينَ تَوَفَّاهُمُ الْمَلَائِكَةُ ظَالِمِي أَنفُسِهِمْ ﴾

## 23-cü fəsil. Uca Allahın: "Mələklər özlərinə zülm edənlərin canlarını alarkən..."[2] sözü

١٧٢٧ – عَنِ ابْنِ عَبَّاسٍ، أَنَّ نَاسًا مِنَ الْمُسْلِمِينَ كَانُوا مَعَ الْمُشْرِكِينَ يُكَثِّرُونَ سَوَادَ الْمُشْرِكِينَ عَلَى عَهْدِ رَسُولِ اللَّهِ ﷺ يَأْتِي السَّهْمُ فَيُرْمَى بِهِ فَيُصِيبُ أَحَدَهُمْ فَيَقْتُلُهُ أَوْ يُضْرَبُ فَيُقْتَلُ فَأَنْزَلَ اللَّهُ: ﴿ إِنَّ الَّذِينَ تَوَفَّاهُمُ الْمَلَائِكَةُ ظَالِمِي أَنفُسِهِمْ ﴾ الآيَةَ. [رواه البخاري: ٤٥٩٦]

**1727.** İbn Abbas ﷺ rəvayət etmişdir ki, (bir vaxt Məkkədə yaşayan) müsəlmanlar məcburiyyət qarşısında müşriklərə qoşulub onların sayını artırır (və onlarla birgə Peyğəmbərə ﷺ qarşı) döyüşürdülər. (Döyüş əsnasında müsəlmanlar tərəfindən) oxla və ya qılıncla vurulub öldürüldükdə Allah bu ayəni nazil etdi: **"Mələklər özlərinə zülm edənlərin canlarını alarkən *onlara*: "Siz nə halda idiniz?"– deyəcəklər. Onlar: "Biz yer üzündə zəif insanlar idik!"– deyəcəklər. *Mələklər də onlara*: "Məgər Allahın torpağı o qədər geniş de-**

---

[1] "ən-Nisa" surəsi, 41.

[2] "ən-Nisa" surəsi, 97. Ayənin tamamı: "**...*onlara*: "Siz nə halda idiniz?"– deyəcəklər. Onlar: "Biz yer üzündə zəif insanlar idik!"– deyəcəklər. *Mələklər də onlara*: "Məgər Allahın torpağı o qədər geniş deyildimi ki, siz orada hicrət edəydiniz?"– deyəcəklər. Onların sığınacaqları yer Cəhənnəmdir. Ora nə pis dönüş yeridir."**

**yildimi ki, siz orada hicrət edəydiniz?"– deyəcəklər. Onların sığınacaqları yer Cəhənnəmdir. Ora nə pis dönüş yeridir."** (əl-Buxari, 4596)

### ٢٤– باب: قَوْلُهُ تَعَالَى:
### ﴿إِنَّآ أَوْحَيْنَآ إِلَيْكَ كَمَآ أَوْحَيْنَآ إِلَىٰ نُوحٍ﴾ إِلَى قَوْلِهِ ﴿وَيُونُسَ وَهَٰرُونَ وَسُلَيْمَٰنَ﴾

### 24-cü fəsil. Uca Allahın: "Biz Nuha və ondan sonrakı peyğəmbərlərə vəhy etdiyimiz kimi sənə də vəhy etdik. Biz İbrahimə, İsmailə, İshaqa, Yaquba və onun nəslinə, İsaya, Əyyuba, Yunusa, Haruna və Süleymana da vəhy etdik. Davuda da Zəburu verdik."[1] sözü

١٧٢٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، عَنِ النَّبِيِّ ﷺ قَالَ: مَنْ قَالَ أَنَا خَيْرٌ مِنْ يُونُسَ بْنِ مَتَّى فَقَدْ كَذَبَ. [رواه البخاري: ٤٦٠٤]

**1728.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim: "Mən Yunus ibn Məttadan daha üstünəm"– desə, yalan danışmış olar." (əl-Buxari, 4604)

## سُورَةُ الْمَائِدَةِ

## əl-Maidə surəsi

### ٢٥– باب: قَوْلُهُ تَعَالَى:
### ﴿يَٰٓأَيُّهَا ٱلرَّسُولُ بَلِّغْ مَآ أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ﴾

### 25-ci fəsil. Uca Allahın: "Ey Rəsul! Rəbbindən sənə nazil ediləni təbliğ et!"[2] sözü

١٧٢٩ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: مَنْ حَدَّثَكَ أَنَّ مُحَمَّدًا ﷺ كَتَمَ شَيْئًا مِمَّا أَنْزَلَ اللَّهُ عَلَيْهِ فَقَدْ كَذَبَ وَاللَّهُ يَقُولُ: ﴿يَٰٓأَيُّهَا ٱلرَّسُولُ بَلِّغْ مَآ أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ﴾ الآيَةَ. [رواه البخاري: ٤٦١٢]

**1729.** Rəvayət edilir ki, (bir dəfə) Aişə ﷺ (Urva ibn Zubeyrə) demişdir: "Kim sənə desə ki, Muhəmməd ﷺ Allahın ona nazil etdiyi (vəhydən) nəyi isə gizlətmişdir, yalan danışmış olar. (Çünki) Allah buyurur: **"Ey Rəsul! Rəbbindən sənə nazil ediləni təbliğ et! Əgər *belə* etməsən, Onun göstərişini – *sənə tapşırdığı elçilik vəzifəsini* yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyar. Şübhəsiz ki, Allah kafir tayfanı doğru yola yönəltməz."** (əl-Buxari, 4612)

[1] "ən-Nisa" surəsi, 163.
[2] "əl-Maidə" surəsi, 67.

## ٢٦– باب: قَوْلُهُ تَعَالَى:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تُحَرِّمُواْ طَيِّبَٰتِ مَآ أَحَلَّ ٱللَّهُ لَكُمۡ ﴾

## 26-cı fəsil. Uca Allahın: "Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu təmiz ruziləri haram etməyin..."[1] sözü

١٧٣٠ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: كُنَّا نَغْزُو مَعَ النَّبِيِّ ﷺ وَلَيْسَ مَعَنَا نِسَاءٌ فَقُلْنَا أَلاَ نَخْتَصِي فَنَهَانَا عَنْ ذَلِكَ فَرَخَّصَ لَنَا بَعْدَ ذَلِكَ أَنْ نَتَزَوَّجَ الْمَرْأَةَ بِالثَّوْبِ ثُمَّ قَرَأَ: ﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تُحَرِّمُواْ طَيِّبَٰتِ مَآ أَحَلَّ ٱللَّهُ لَكُمۡ ﴾. [رواه البخاري: ٤٦١٥]

**1730.** Rəvayət edilir ki, Abdullah (ibn Məsud) ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə döyüşlərdə iştirak edərkən yanımızda qadın olmurdu. (Bir dəfə) biz (ona) dedik: "Özümüzü axtalayaqmı?" O bunu bizə qadağan etdi və bundan sonra qadına (mehr olaraq) paltar (və ya başqa bir şey verib) onunla (müvəqqəti) nikaha girməyə[2] rüsxət verdi, sonra da bu ayəni oxudu: **"Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu təmiz ruziləri haram etməyin..."** (əl-Buxari, 4615)

## ٢٧– باب: قَوْلُهُ تَعَالَى:

﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِنَّمَا ٱلۡخَمۡرُ وَٱلۡمَيۡسِرُ وَٱلۡأَنصَابُ وَٱلۡأَزۡلَٰمُ رِجۡسٞ مِّنۡ عَمَلِ ٱلشَّيۡطَٰنِ ﴾

## 27-ci fəsil. Uca Allahın: "Ey iman gətirənlər! Şübhəsiz ki, sərxoşedici *içki* də, qumar da, *tapınmaq məqsədilə* dik qoyulmuş daşlar da, fal oxları da şeytan əməlindən olan murdar şeylərdir..."[3] sözü

١٧٣١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ مَا كَانَ لَنَا خَمْرٌ غَيْرُ فَضِيخِكُمْ هَذَا الَّذِي تُسَمُّونَهُ الْفَضِيخَ فَإِنِّي لَقَائِمٌ أَسْقِي أَبَا طَلْحَةَ وَفُلاَنًا وَفُلاَنًا إِذْ جَاءَ رَجُلٌ فَقَالَ وَهَلْ بَلَغَكُمُ الْخَبَرُ فَقَالُوا وَمَا ذَاكَ قَالَ حُرِّمَتِ الْخَمْرُ قَالُوا أَهْرِقْ هَذِهِ الْقِلاَلَ يَا أَنَسُ قَالَ فَمَا سَأَلُوا عَنْهَا وَلاَ رَاجَعُوهَا بَعْدَ خَبَرِ الرَّجُلِ. [رواه البخاري: ٤٦١٧]

**1731.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(O vaxtlar) bizim "fədix" adlandırdığınız (xurma şərabından başqa) bir şərabımız yox idi. (Bir dəfə) mən Əbu Təlhəyə, filankəsə və filankəsə şərab paylayarkən birdən (əshabələrdən) biri gəlib dedi: "Sizə xəbər çatıbmı?" Onlar soruşdular: "Nə olub ki?" O de-

[1] "əl-Maidə" surəsi, 87. Ayənin tamamı: **"...və həddi aşmayın. Həqiqətən, Allah həddi aşanları sevmir."**

[2] 1643-cü hədisə bax.

[3] "əl-Maidə" surəsi, 90. Ayənin tamamı: **"...Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız".**

di: “Şərab haram buyruldu!” (Bunu eşidəndə) onlar mənə dedilər: “Apar bu bardaqlardakı (şərabı) çölə tök, ey Ənəs!”

Onlar bu adamın gətirdiyi xəbərdən sonra içkinin (niyə haram buyrulması) barədə soruşmadılar və bunu heç araşdırmadılar da.” (əl-Buxari, 4617)

## ٢٨– باب: قَوْلُهُ تَعَالَى:
## ﴿لَا تَسْـَٔلُوا۟ عَنْ أَشْيَآءَ إِن تُبْدَ لَكُمْ تَسُؤْكُمْ﴾

## 28-ci fəsil. Uca Allahın: “Ey iman gətirənlər! Sizə agah olunca, xoşunuza gəlməyəcək şeylər barəsində soruşmayın.”[1] sözü

١٧٣٢ – عَنْ أَنَسٍ ﷺ قَالَ: خَطَبَ رَسُولُ اللَّهِ ﷺ خُطْبَةً مَا سَمِعْتُ مِثْلَهَا قَطُّ قَالَ لَوْ تَعْلَمُونَ مَا أَعْلَمُ لَضَحِكْتُمْ قَلِيلاً وَلَبَكَيْتُمْ كَثِيرًا قَالَ فَغَطَّى أَصْحَابُ رَسُولِ اللَّهِ ﷺ وُجُوهَهُمْ لَهُمْ خَنِينٌ فَقَالَ رَجُلٌ مَنْ أَبِي قَالَ فُلَانٌ فَنَزَلَتْ هَذِهِ الآيَةُ: ﴿لَا تَسْـَٔلُوا۟ عَنْ أَشْيَآءَ إِن تُبْدَ لَكُمْ تَسُؤْكُمْ﴾. [رواه البخاري: ٤٦٢١]

**1732.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: (Bir dəfə) Peyğəmbər ﷺ elə bir xütbə verdi ki, bu vaxta qədər beləsini eşitməmişdim. O buyurdu: “Əgər mən bildiyimi siz bilsəydiniz, az gülüb çox ağlayardınız!” Bu vaxt əshabələr üzlərini tutub inilti ilə ağlamağa başladılar. Bu vaxt bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: “Mənim atam kimdir?” Peyğəmbər ﷺ: “Filankəsdir”– dedi və bu ayə nazil oldu: **“Ey iman gətirənlər! Sizə agah olunca, xoşunuza gəlməyəcək şeylər barəsində soruşmayın...”** (əl-Buxari, 4621)

١٧٣٣ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: كَانَ قَوْمٌ يَسْأَلُونَ رَسُولَ اللَّهِ ﷺ اسْتِهْزَاءً فَيَقُولُ الرَّجُلُ مَنْ أَبِي وَيَقُولُ الرَّجُلُ تَضِلُّ نَاقَتُهُ أَيْنَ نَاقَتِي فَأَنْزَلَ اللَّهُ فِيهِمْ هَذِهِ الآيَةَ: ﴿يَـٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَسْـَٔلُوا۟ عَنْ أَشْيَآءَ إِن تُبْدَ لَكُمْ تَسُؤْكُمْ﴾ حَتَّى فَرَغَ مِنْ الآيَةِ. [رواه البخاري: ٤٦٢٢]

**1733.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: “(Vaxtı ilə) bəzi (nanəciblər) istehza ilə Peyğəmbərə ﷺ suallar verərdilər. Kimisi: “Mənim atam kimdir?”, kimisi də dəvəsini soraqlayaraq: “Dəvəm haradadır?”– deyirdi. Allah onlar barədə bu ayəni nazil etdi: **“Ey iman gətirənlər! Sizə agah olunca, xoşunuza gəlməyəcək şeylər barəsində soruşmayın...”** (əl-Buxari, 4622)

[1] “əl-Maidə” surəsi, 101. Ayənin tamamı: **“...Əgər Quran nazil edildiyi zaman onlar haqqında soruşsanız, sizə aydın olar. Allah bunları –** ***indiyə qədər verdiyiniz bu cür sualları*** **əfv etdi. Allah Bağışlayandır, Rəhmlidir.”**

# سُورَةُ الأَنْعَامِ

# əl-Ənam surəsi

## ٢٩– باب: قَوْلُهُ تَعَالَى: ﴿ قُلْ هُوَ ٱلْقَادِرُ عَلَىٰٓ أَن يَبْعَثَ عَلَيْكُمْ عَذَابًا مِّن فَوْقِكُمْ ﴾

## 29-cu fəsil. Uca Allahın: "De: "*Allah* başınızın üstündən və ya ayaqlarınızın altından sizə əzab göndərməyə, ya da sizi qarışıqlığa salıb dəstə-dəstə etməyə və birinizə digərinin gücünü daddırmağa qadirdir"[1]– sözü

١٧٣٤ – عَنْ جَابِرٍ ﷺ قَالَ: لَمَّا نَزَلَتْ هَذِهِ الآيَةُ: ﴿ قُلْ هُوَ ٱلْقَادِرُ عَلَىٰٓ أَن يَبْعَثَ عَلَيْكُمْ عَذَابًا مِّن فَوْقِكُمْ ﴾ قَالَ رَسُولُ اللَّهِ ﷺ: أَعُوذُ بِوَجْهِكَ قَالَ: ﴿أَوْ مِن تَحْتِ أَرْجُلِكُمْ ﴾ قَالَ أَعُوذُ بِوَجْهِكَ: ﴿أَوْ يَلْبِسَكُمْ شِيَعًا وَيُذِيقَ بَعْضَكُم بَأْسَ بَعْضٍ ﴾ قَالَ رَسُولُ اللَّهِ ﷺ: هَذَا أَهْوَنُ أَوْ هَذَا أَيْسَرُ. [رواه البخاري: ٤٦٢٨]

**1734.** Rəvayət edilir ki, Cabir demişdir: "Bu ayə: **"De: "*Allah* başınızın üstündən sizə əzab göndərməyə qadirdir..."** nazil olduqda Peyğəmbər ﷺ dedi: "(Allahım,) Sənin Üzünə sığınıram!" (Allah buyurdu): **"...və ya ayaqlarınızın altından..."** Peyğəmbər ﷺ dedi: "(Allahım,) Sənin Üzünə sığınıram!" (Allah buyurdu): **"...ya da sizi qarışıqlığa salıb dəstə-dəstə etməyə və birinizə digərinin gücünü daddırmağa qadirdir".** Peyğəmbər ﷺ dedi: "Bu bir az yüngüldür". (əl-Buxari, 4628)

## ٣٠– باب: قَوْلُهُ تَعَالَى: ﴿ أُوْلَٰٓئِكَ ٱلَّذِينَ هَدَى ٱللَّهُ ۖ فَبِهُدَىٰهُمُ ٱقْتَدِهْ ۗ ﴾

## 30-cu fəsil. Uca Allahın: "Bunlar Allahın doğru yola yönəltdiyi kəslərdir. Sən də onların haqq yoluna yönəl"[2]– sözü

١٧٣٥ – عَنْ ابْنَ عَبَّاسٍ رضي الله عنهما أَنَّهُ سُئِلَ: أَفِي ﴿صٓ ﴾ سَجْدَةٌ؟ فَقَالَ: نَعَمْ ثُمَّ تَلَا: ﴿وَوَهَبْنَا لَهُۥٓ إِسْحَٰقَ وَيَعْقُوبَ ﴾ إِلَى قَوْلِهِ ﴿فَبِهُدَىٰهُمُ ٱقْتَدِهْ ﴾ ثُمَّ قَالَ: نَبِيُّكُمْ ﷺ مِمَّنْ أُمِرَ أَنْ يَقْتَدِيَ بِهِمْ. [رواه البخاري: ٤٦٣٢]

**1735.** Rəvayət edilir ki, İbn Abbasdan رضي الله عنهما soruşdular: "**Sad**" surəsində səcdə (qılmaq əmr edilən ayə) varmı?" İbn Abbas رضي الله عنهما: "Bəli!"- dedi və bu ayələri oxudu: **"Biz ona İshaqı və Yaqubu bəxş etdik. Hər ikisini doğru yola yönəltdik. *Bundan* əvvəl Nuhu da doğru yola yönəltmişdik. Onun nəslindən olan Davudu, Süleymanı, Əyyubu, Yusufu, Musanı və Harunu da. Biz yaxşı əməl sahiblərini belə mükafatlandırırıq. Zəkəriyyanı, Yəhyanı, İsanı və İl-**

---

[1] "əl-Ənam" surəsi, 65. Ayənin tamamı: "....Gör ayələrimizi necə izah edirik ki, bəlkə başa düşsünlər."

[2] "əl-Ənam" surəsi, 90. Ayənin tamamı: **"De: "Mən bunun əvəzinə sizdən heç bir mükafat istəmirəm. Bu *Kitab* aləmlər üçün yalnız bir xatırlatmadır."**

**yası da. Hamısı əməlisalehlərdən idilər. İsmaili, Əlyəsəni, Yunusu və Lutu da. Hamısını aləmlərdən üstün etdik. Onların atalarından, nəsillərindən və qardaşlarından bəzilərini də. Onları seçdik və düz yola yönəltdik. Bu, Allahın hidayətidir. Bununla O, qullarından istədiyi şəxsi doğru yola yönəldir. Əgər *Ona* şərik qoşsaydılar, əlbəttə, etdikləri əməllər puç olardı. Bunlar, Kitab, hikmət və peyğəmbərlik verdiyimiz kəslərdir. Əgər *kafirlər* ayələri inkar etsələr, Biz onları inkar etməyən bir qövmə həvalə edərik. Bunlar Allahın doğru yola yönəltdiyi kəslərdir. Sən də onların haqq yoluna yönəl..."**[1] (əl-Buxari, 4632)

## ٣١– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَلَا تَقْرَبُوا۟ ٱلْفَوَٰحِشَ مَا ظَهَرَ مِنْهَا وَمَا بَطَنَ﴾

## 31-ci fəsil. Uca Allahın: "...Murdar əməllərin aşkarına da, gizlisinə də yaxınlaşmayın..."[2] sözü

١٧٣٦ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: لاَ أَحَدَ أَغْيَرُ مِنَ اللَّهِ وَلِذَلِكَ حَرَّمَ الْفَوَاحِشَ مَا ظَهَرَ مِنْهَا وَمَا بَطَنَ وَلاَ شَيْءَ أَحَبُّ إِلَيْهِ الْمَدْحُ مِنَ اللَّهِ وَلِذَلِكَ مَدَحَ نَفْسَهُ. [رواه البخاري: ٤٦٣٢]

**1736.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Allahdan daha qeyrətli bir kimsə yoxdur. Elə buna görə də O, murdar əməllərin aşkarını da, gizlisini də haram buyurmuşdur. Bir də ki, Allah üçün tərif olunmaqdan daha əziz bir şey yoxdur. Odur ki, O, Özünü tərifləyir." (əl-Buxari, 4634)

# سُورَةُ الأَعْرَافِ

# əl-Əraf surəsi

## ٣٢– باب: قَوْلُهُ تَعَالَى: ﴿خُذِ ٱلْعَفْوَ وَأْمُرْ بِٱلْعُرْفِ وَأَعْرِضْ عَنِ ٱلْجَٰهِلِينَ﴾

## 32-ci fəsil.
## Uca Allahın: "Sən bağışlama *yolunu* tut, yaxşı iş görməyi əmr et və cahillərdən üz döndər"[3]– sözü

١٧٣٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ الزُّبَيْرِ ﷺ قَالَ: أَمَرَ اللَّهُ نَبِيَّهُ ﷺ أَنْ يَأْخُذَ الْعَفْوَ مِنْ أَخْلاَقِ النَّاسِ. [رواه البخاري: ٤٦٤٤]

**1737.** Rəvayət edilir ki, Abdullah ibn Zubeyr ﷺ demişdir: "Allah Öz peyğəmbərinə ﷺ insani əxlaq içərisindən bağışlanma yolunu tutmağı əmr etmişdir." (əl-Buxari, 4644)

---

[1] "əl-Ənam" surəsi, 84-90.
[2] "əl-Ənam" surəsi, 151.
[3] "əl-Əraf" surəsi, 199.

# سُورَةُ الأَنْفَالِ

# əl-Ənfal surəsi

## ٣٣– باب: قَوْلُهُ تَعَالَى: ﴿ وَقَٰتِلُوهُمْ حَتَّىٰ لَا تَكُونَ فِتْنَةٌ وَيَكُونَ ٱلدِّينُ كُلُّهُۥ لِلَّهِ ﴾

## 33-cü fəsil.
## Uca Allahın: "Fitnə aradan qalxana qədər və din tamamilə yalnız Allaha həsr edilənədək onlarla vuruşun!"[1] sözü

١٧٣٨ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما: أَنَّهُ سُئِلَ كَيْفَ تَرَى فِي قِتَالِ الْفِتْنَةِ؟ فَقَالَ: وَهَلْ تَدْرِي مَا الْفِتْنَةُ؟ كَانَ مُحَمَّدٌ ﷺ يُقَاتِلُ الْمُشْرِكِينَ وَكَانَ الدُّخُولُ عَلَيْهِمْ فِتْنَةً وَلَيْسَ كَقِتَالِكُمْ عَلَى الْمُلْكِ. [رواه البخاري: ٤٦٥١]

**1738.** Rəvayət edilir ki, Abdullah ibn Ömərdən رضي الله عنهما soruşdular: "Döyüşdə olan fitnə barədə nə deyə bilərsən?" İbn Ömər dedi: "Sən heç fitnənin nə olduğunu bilirsən?! Muhəmməd ﷺ fitnəni aradan qaldırmaq üçün müşriklərin üstünə gedib onlarla vuruşardı. Daha sizin kimi hakimiyyət uğrunda vuruşmazdı." (əl-Buxari, 4651)

# سُورَةُ البَرَاءَةِ (التَّوْبَةِ)

# ət-Tovbə[2] surəsi

## ٣٤– باب: قَوْلُهُ تَعَالَى: ﴿ وَءَاخَرُونَ ٱعْتَرَفُواْ بِذُنُوبِهِمْ ﴾

## 34-cü fəsil.
## Uca Allahın: "Digərləri isə günahlarını etiraf etdilər..."[3] sözü

١٧٣٩ – عَنْ سَمُرَةَ بْنِ جُنْدَبٍ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لَنَا: أَتَانِي اللَّيْلَةَ آتِيَانِ فَابْتَعَثَانِي فَانْتَهَيْنَا إِلَى مَدِينَةٍ مَبْنِيَّةٍ بِلَبِنِ ذَهَبٍ وَلَبِنِ فِضَّةٍ فَتَلَقَّانَا رِجَالٌ شَطْرٌ مِنْ خَلْقِهِمْ كَأَحْسَنِ مَا أَنْتَ رَاءٍ وَشَطْرٌ كَأَقْبَحِ مَا أَنْتَ رَاءٍ قَالاَ لَهُمْ اذْهَبُوا فَقَعُوا فِي ذَلِكَ النَّهْرِ فَوَقَعُوا فِيهِ ثُمَّ رَجَعُوا إِلَيْنَا قَدْ ذَهَبَ ذَلِكَ السُّوءُ عَنْهُمْ فَصَارُوا فِي أَحْسَنِ صُورَةٍ قَالاَ لِي هَذِهِ جَنَّةُ عَدْنٍ وَهَذَاكَ مَنْزِلُكَ قَالاَ أَمَّا الْقَوْمُ الَّذِينَ كَانُوا شَطْرٌ مِنْهُمْ حَسَنٌ وَشَطْرٌ مِنْهُمْ قَبِيحٌ فَإِنَّهُمْ خَلَطُوا عَمَلاً صَالِحًا وَآخَرَ سَيِّئًا تَجَاوَزَ اللَّهُ عَنْهُمْ. [رواه البخاري: ٤٦٧٤]

**1739.** Səmura ibn Cundəb رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ bizə demişdir: "Bu gecə iki nəfər yanıma gəlib məni (binaları) qızıl və gümüş kərpiclərdən tikilmiş

---

[1] "əl-Ənfal" surəsi, 39.
[2] "əl-Bəraə" surəsi.
[3] "ət-Tovbə" surəsi, 102. Ayənin tamamı: "**Onlar yaxşı bir əməllə başqa bir pis əməli qarışdırdılar. Ola bilsin ki, Allah onların tövbələrini qəbul etsin. Həqiqətən, Allah Bağışlayandır, Rəhmlidir**"

şəhərə apardılar. Orada bizi bədənlərinin yarısı gördüyün ən gözəl şəkildə, o biri yarısı isə gördüyün ən eybəcər şəkildə olan insanlar qarşıladı. O iki nəfər onlara: “Gedin, o çaya girin!”– dedilər. Onlar gedib çaya girdilər, sonra bizim yanımıza qayıtdılar. Beləliklə, bu insanların eybəcərliyi yox oldu və onlar ən gözəl surəti aldılar.” O iki nəfər mənə dedi: “Bu, Ədn cənnətidir, bura da sənin (əbədi) qalacağın yerdir. O ki qaldı yarıgözəl, yarıeybəcər adamlara, onlar yaxşı işləri pis əməllərlə qarışdıranlar idi. (Lakin) Allah onları bağışladı.” (əl-Buxari, 4674)

سُورَةُ هُودٍ

# Hud surəsi

## ٣٥– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَكَانَ عَرْشُهُۥ عَلَى ٱلْمَآءِ﴾

## 35-cü fəsil. Uca Allahın: “...Ərşi su üzərində ikən...”[1] sözü

١٧٤٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: قَالَ اللَّهُ عَزَّ وَجَلَّ أَنْفِقْ أُنْفِقْ عَلَيْكَ وَقَالَ: يَدُ اللَّهِ مَلأَى لاَ تَغِيضُهَا نَفَقَةٌ سَحَّاءُ اللَّيْلَ وَالنَّهَارَ وَقَالَ أَرَأَيْتُمْ مَا أَنْفَقَ مُنْذُ خَلَقَ السَّمَاءَ وَالأَرْضَ فَإِنَّهُ لَمْ يَغِضْ مَا فِي يَدِهِ وَكَانَ عَرْشُهُ عَلَى الْمَاءِ وَبِيَدِهِ الْمِيزَانُ يَخْفِضُ وَيَرْفَعُ. [رواه البخاري: ٤٦٨٤]

**1740.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qüdrətli və əzəmətli Allah buyurur: “(Malından Mənim yolumda) xərclə, Mən də sənə xərcləyəcəyəm.”

Peyğəmbər ﷺ demişdir: “Allahın Əli doludur. (Bu nemətlərin) səhər-axşam ardı-arası kəsilmədən xərclənməsi Onun Əlini boş qoya bilməz.” Həmçinin demişdir: “Məgər Allahın göyü və yeri yaratdığı gündən bəri nə qədər xərclədiyini görmürsünüz?! Bu Onun Əlindəkilərin azalmasına (zərrə qədər) təsir göstərməmişdir. O zaman Onun Ərşi suyun üzərində idi, Əlində də tərəzi var idi. O, (bu tərəzini) aşağı endirir və yuxarı qaldırırdı.” (əl-Buxari, 4684)

## ٣٦– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَكَذَٰلِكَ أَخْذُ رَبِّكَ إِذَآ أَخَذَ ٱلْقُرَىٰ وَهِىَ ظَٰلِمَةٌ﴾

## 36-cı fəsil. Uca Allahın: “Rəbbin, haqsızlıq edən məmləkətləri yaxaladığı zaman belə yaxalayır...”[2]– sözü

١٧٤١ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ إِنَّ اللَّهَ لَيُمْلِي لِلظَّالِمِ حَتَّى إِذَا أَخَذَهُ لَمْ يُفْلِتْهُ قَالَ ثُمَّ قَرَأَ: ﴿وَكَذَٰلِكَ أَخْذُ رَبِّكَ إِذَآ أَخَذَ ٱلْقُرَىٰ وَهِىَ ظَٰلِمَةٌ إِنَّ أَخْذَهُۥٓ أَلِيمٌ شَدِيدٌ﴾. [رواه البخاري: ٤٦٨٦]

[1] “Hud” surəsi, 7. Ayənin tamamı: **“...göyləri və yeri altı gündə yaradan Odur. Əgər sən: “Siz öləndən sonra diriləcəksiniz!”– desən, kafir olanlar: “Bu, açıq-aydın bir sehrdir!”– deyərlər.”**

[2] “Hud” surəsi, 102. Ayənin tamamı: **“...Onun yaxalaması həqiqətən də, üzücüdür, şiddətlidir.”**

**1741.** Əbu Musa ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah zalıma (müəyyən vaxtadək) möhlət verər. Nəhayət, onu yaxaladıqdan (sonra heç vaxt) onu buraxmaz." Sonra Peyğəmbər ﷺ bu ayəni oxudu: **"Rəbbin haqsızlıq edən məmləkətləri yaxaladığı zaman belə yaxalayır. Onun yaxalaması həqiqətən də, üzücüdür, şiddətlidir."** (əl-Buxari, 4686)

# سُورَةُ الحِجْرِ

# Hicr surəsi

## ٣٧– باب: قَوْلُهُ تَعَالَى: ﴿ إِلَّا مَنِ ٱسْتَرَقَ ٱلسَّمْعَ فَأَتْبَعَهُۥ شِهَابٌ مُّبِينٌ ﴾

## 37-ci fəsil. Uca Allahın: "Ancaq *şeytanlardan* kim *göy əhlinin danışıqlarına* xəlvətcə qulaq assa, onu yandırıb-yaxan alov təqib edər"[1]– sözü

١٧٤٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁، يَبْلُغُ بِهِ النَّبِيَّ ﷺ قَالَ: إِذَا قَضَى اللَّهُ الأَمْرَ فِي السَّمَاءِ ضَرَبَتْ الْمَلائِكَةُ بِأَجْنِحَتِهَا خُضْعَانًا لِقَوْلِهِ كَالسِّلْسِلَةِ عَلَى صَفْوَانٍ فَإِذَا: ﴿فُزِّعَ عَن قُلُوبِهِمْ قَالُوا۟ مَاذَا قَالَ رَبُّكُمْ ۖ قَالُوا۟﴾ لِلَّذِي قَالَ: ﴿ٱلْحَقَّ ۖ وَهُوَ ٱلْعَلِىُّ ٱلْكَبِيرُ﴾ فَيَسْمَعُهَا مُسْتَرِقُو السَّمْعِ وَمُسْتَرِقُو السَّمْعِ هَكَذَا وَاحِدٌ فَوْقَ آخَرَ فَرُبَّمَا أَدْرَكَ الشِّهَابُ الْمُسْتَمِعَ قَبْلَ أَنْ يَرْمِيَ بِهَا إِلَى صَاحِبِهِ فَيُحْرِقَهُ وَرُبَّمَا لَمْ يُدْرِكْهُ حَتَّى يَرْمِيَ بِهَا إِلَى الَّذِي يَلِيهِ إِلَى الَّذِي هُوَ أَسْفَلَ مِنْهُ حَتَّى يُلْقُوهَا إِلَى الأَرْضِ فَتُلْقَى عَلَى فَمِ السَّاحِرِ فَيَكْذِبُ مَعَهَا مِائَةَ كَذْبَةٍ فَيُصَدَّقُ فَيَقُولُونَ أَلَمْ يُخْبِرْنَا يَوْمَ كَذَا وَكَذَا يَكُونُ كَذَا وَكَذَا فَوَجَدْنَاهُ حَقًّا لِلْكَلِمَةِ الَّتِي سُمِعَتْ مِنَ السَّمَاءِ. [رواه البخاري: ٤٧٠١]

**1742.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah göydə bir iş barəsində qərar verdiyi zaman mələklər Onun əmrinə müntəzir olduqlarını bildirərək qanadlarını çarpırlar (və bu vaxt elə bir səs gəlir ki,) sanki (bir topa) zənciri qayaya çırpırlar. Nəhayət, **"*mələklərin* qəlbindən qorxu keçib getdikdə onlar: "Rəbbiniz nə buyurdu?"– deyə soruşurlar..."**[2] Onlara belə cavab verilir: **"Haqqı *buyurdu*! O, Ucadır, Böyükdür!"**[3] Oğrun-oğrun qulaq asan (şeytanlar) bu sözləri eşidirlər. (Bundan ötrü) onlar bir-birinin üstünə çıxırlar. Olur ki, (mələklərin söhbətinə) qulaq asan şeytanı (düşən) ulduz təqib edir və o, eşitdiyini (aşağıda duran) yoldaşına çatdırmamışdan əvvəl (həmin ulduz) onu yandırıb yaxır. Bəzən də ulduz ona dəyməmişdən əvvəl o, eşitdiyini altında duran dostuna ötürür. Beləcə, şeytanlar bu eşitdiklərini yer üzünə çatdırır və onu sehrbaza təlqin edirlər. Sehrbaz da eşitdiyi (sözə) yüz yalan əlavə edir və (doğru söz) öz təsdiqini tapır. (Sehrbazın dediklərinin düz çıxdığını görən avam) insanlar isə deyirlər: "Məgər o bizə fi-

---

[1] "əl-Hicr" surəsi, 18.
[2] "Səba" surəsi, 23.
[3] "Səba" surəsi, 23.

lan gün filan, filan hadisə baş verəcəyini xəbər verməmişdi? Biz ki onun gerçək olduğunu görmüşük!"
Yalnız göydən eşidilən (haqq) söz öz təsdiqini tapır." (əl-Buxari, 4701)

سُورَةُ النَّحْلِ

## Nəhl surəsi

٣٨– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَمِنكُم مَّن يُرَدُّ إِلَىٰٓ أَرْذَلِ ٱلْعُمُرِ﴾

### 38-ci fəsil. Uca Allahın: "Sizlərdən bəziləri *vaxtilə* bildiyi şeyləri unutsun deyə, ömrünün ən rəzil çağına çatdırılacaq"[1] sözü

١٧٤٣ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ، أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَدْعُو أَعُوذُ بِكَ مِنَ الْبُخْلِ وَالْكَسَلِ وَأَرْذَلِ الْعُمُرِ وَعَذَابِ الْقَبْرِ وَفِتْنَةِ الدَّجَّالِ وَفِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ. [رواه البخاري: ٤٧٠١]

**1743.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ dua edib deyərdi: "Əuzu bikə minəl-buxli vəl-kəsəli və ərzəlil-umuri və əzabil-qabri və fitnətid-dəccali və fitnətil-məhya vəl-məmati"[2]. (əl-Buxari, 4707)

سُورَةُ بَنِي إِسْرَائِيلَ (الإِسْرَاءِ)

## Bənu İsrail[3] surəsi

٣٩– باب: قَوْلُهُ تَعَالَى: ﴿ذُرِّيَّةَ مَنْ حَمَلْنَا مَعَ نُوحٍ ۚ إِنَّهُۥ كَانَ عَبْدًا شَكُورًا﴾

### 39-cu fəsil. Uca Allahın: "*Ey* Nuhla birlikdə *gəmidə* daşıdıqlarımızın nəsli! Nuh doğrudan da *Bizə* minnətdar olan bir qul idi"[4]– sözü

١٧٤٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ أُتِيَ بِلَحْمٍ فَرُفِعَ إِلَيْهِ الذِّرَاعُ وَكَانَتْ تُعْجِبُهُ فَنَهَشَ مِنْهَا نَهْشَةً ثُمَّ قَالَ: أَنَا سَيِّدُ النَّاسِ يَوْمَ الْقِيَامَةِ وَهَلْ تَدْرُونَ مِمَّ ذَلِكَ يَجْمَعُ اللَّهُ النَّاسَ الأَوَّلِينَ وَالآخِرِينَ فِي صَعِيدٍ وَاحِدٍ يُسْمِعُهُمُ الدَّاعِي وَيَنْفُذُهُمُ الْبَصَرُ وَتَدْنُو الشَّمْسُ فَيَبْلُغُ النَّاسَ مِنَ الْغَمِّ وَالْكَرْبِ مَا لاَ يُطِيقُونَ وَلاَ يَحْتَمِلُونَ فَيَقُولُ النَّاسُ أَلاَ تَرَوْنَ مَا قَدْ بَلَغَكُمْ أَلاَ تَنْظُرُونَ مَنْ يَشْفَعُ لَكُمْ إِلَى رَبِّكُمْ فَيَقُولُ بَعْضُ النَّاسِ لِبَعْضٍ عَلَيْكُمْ بِآدَمَ فَيَأْتُونَ آدَمَ عليه السلام فَيَقُولُونَ لَهُ أَنْتَ أَبُو الْبَشَرِ خَلَقَكَ اللَّهُ بِيَدِهِ وَنَفَخَ فِيكَ مِنْ رُوحِهِ وَأَمَرَ الْمَلاَئِكَةَ

---

[1] "ən-Nəhl" surəsi, 70.
[2] Tərcüməsi: (Allahım,) xəsislikdən, tənbəllikdən, qocalığın ən düşkün çağına çatmaqdan, qəbir əzabından, dəccalın fitnəsindən və həyatın və ölümün fitnəsindən Sənə sığınıram.
[3] "əl-İsra" surəsi.
[4] "əl-İsra" surəsi, 3.

فَسَجَدُوا لَكَ اشْفَعْ لَنَا إِلَى رَبِّكَ أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ أَلاَ تَرَى إِلَى مَا قَدْ بَلَغَنَا فَيَقُولُ آدَمُ إِنَّ رَبِّي قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ وَإِنَّهُ قَدْ نَهَانِي عَنْ الشَّجَرَةِ فَعَصَيْتُهُ نَفْسِي نَفْسِي نَفْسِي اذْهَبُوا إِلَى غَيْرِي اذْهَبُوا إِلَى نُوحٍ فَيَأْتُونَ نُوحًا فَيَقُولُونَ يَا نُوحُ إِنَّكَ أَنْتَ أَوَّلُ الرُّسُلِ إِلَى أَهْلِ الْأَرْضِ وَقَدْ سَمَّاكَ اللَّهُ عَبْدًا شَكُورًا اشْفَعْ لَنَا إِلَى رَبِّكَ أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ فَيَقُولُ إِنَّ رَبِّي عَزَّ وَجَلَّ قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ وَإِنَّهُ قَدْ كَانَتْ لِي دَعْوَةٌ دَعَوْتُهَا عَلَى قَوْمِي نَفْسِي نَفْسِي نَفْسِي اذْهَبُوا إِلَى غَيْرِي اذْهَبُوا إِلَى إِبْرَاهِيمَ فَيَأْتُونَ إِبْرَاهِيمَ فَيَقُولُونَ يَا إِبْرَاهِيمُ أَنْتَ نَبِيُّ اللَّهِ وَخَلِيلُهُ مِنْ أَهْلِ الْأَرْضِ اشْفَعْ لَنَا إِلَى رَبِّكَ أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ فَيَقُولُ لَهُمْ إِنَّ رَبِّي قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ وَإِنِّي قَدْ كُنْتُ كَذَبْتُ ثَلاَثَ كَذِبَاتٍ نَفْسِي نَفْسِي نَفْسِي اذْهَبُوا إِلَى غَيْرِي اذْهَبُوا إِلَى مُوسَى فَيَأْتُونَ مُوسَى فَيَقُولُونَ يَا مُوسَى أَنْتَ رَسُولُ اللَّهِ فَضَّلَكَ اللَّهُ بِرِسَالَتِهِ وَبِكَلاَمِهِ عَلَى النَّاسِ اشْفَعْ لَنَا إِلَى رَبِّكَ أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ فَيَقُولُ إِنَّ رَبِّي قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ وَإِنِّي قَدْ قَتَلْتُ نَفْسًا لَمْ أُومَرْ بِقَتْلِهَا نَفْسِي نَفْسِي نَفْسِي اذْهَبُوا إِلَى غَيْرِي اذْهَبُوا إِلَى عِيسَى ابْنِ مَرْيَمَ فَيَأْتُونَ عِيسَى فَيَقُولُونَ يَا عِيسَى أَنْتَ رَسُولُ اللَّهِ وَكَلِمَتُهُ أَلْقَاهَا إِلَى مَرْيَمَ وَرُوحٌ مِنْهُ وَكَلَّمْتَ النَّاسَ فِي الْمَهْدِ صَبِيًّا اشْفَعْ لَنَا إِلَى رَبِّكَ أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ فَيَقُولُ عِيسَى إِنَّ رَبِّي قَدْ غَضِبَ الْيَوْمَ غَضَبًا لَمْ يَغْضَبْ قَبْلَهُ مِثْلَهُ قَطُّ وَلَنْ يَغْضَبَ بَعْدَهُ مِثْلَهُ وَلَمْ يَذْكُرْ ذَنْبًا نَفْسِي نَفْسِي نَفْسِي اذْهَبُوا إِلَى غَيْرِي اذْهَبُوا إِلَى مُحَمَّدٍ فَيَأْتُونَ مُحَمَّدًا فَيَقُولُونَ يَا مُحَمَّدُ أَنْتَ رَسُولُ اللَّهِ وَخَاتِمُ الْأَنْبِيَاءِ وَقَدْ غَفَرَ اللَّهُ لَكَ مَا تَقَدَّمَ مِنْ ذَنْبِكَ وَمَا تَأَخَّرَ اشْفَعْ لَنَا إِلَى رَبِّكَ أَلاَ تَرَى إِلَى مَا نَحْنُ فِيهِ فَأَنْطَلِقُ فَآتِي تَحْتَ الْعَرْشِ فَأَقَعُ سَاجِدًا لِرَبِّي عَزَّ وَجَلَّ ثُمَّ يَفْتَحُ اللَّهُ عَلَيَّ مِنْ مَحَامِدِهِ وَحُسْنِ الثَّنَاءِ عَلَيْهِ شَيْئًا لَمْ يَفْتَحْهُ عَلَى أَحَدٍ قَبْلِي ثُمَّ يُقَالُ يَا مُحَمَّدُ ارْفَعْ رَأْسَكَ سَلْ تُعْطَهْ وَاشْفَعْ تُشَفَّعْ فَأَرْفَعُ رَأْسِي فَأَقُولُ أُمَّتِي يَا رَبِّ أُمَّتِي يَا رَبِّ أُمَّتِي يَا رَبِّ فَيُقَالُ يَا مُحَمَّدُ أَدْخِلْ مِنْ أُمَّتِكَ مَنْ لاَ حِسَابَ عَلَيْهِمْ مِنْ الْبَابِ الْأَيْمَنِ مِنْ أَبْوَابِ الْجَنَّةِ وَهُمْ شُرَكَاءُ النَّاسِ فِيمَا سِوَى ذَلِكَ مِنْ الْأَبْوَابِ ثُمَّ قَالَ وَالَّذِي نَفْسِي بِيَدِهِ إِنَّ مَا بَيْنَ الْمِصْرَاعَيْنِ مِنْ مَصَارِيعِ الْجَنَّةِ كَمَا بَيْنَ مَكَّةَ وَحِمْيَرَ أَوْ كَمَا بَيْنَ مَكَّةَ وَبُصْرَى. [رواه البخاري: ٤٧٠١]

**1744.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbərə ﷺ cəmdək gətirdilər. Sonra bu cəmdəyin qol tərəfini (bişirib) ona verdilər. Ətin bu yeri onun xoşuna gəlirdi. O, ətdən bir tikə dişlədikdən sonra dedi: "Qiyamət günü mən insanların ən hörmətlisi olacağam. Bunun nə səbəbdən belə olduğunu bilirsinizmi? Allah əvvəlkiləri və sonrakıları, – (insanların hamısını) – elə bir yerə yığacaq ki, carçı onları çağıra bilsin, gözlər də onları əhatə etsin. Günəş insanlara yaxınlaşdıqdan sonra onları elə bir dərd və kədər bürüyəcək ki, onlar buna nə tab gətirəcək, nə də dözə biləcəklər. Onda onlar (bir-birilərinə) deyəcəklər: "Başınıza gələnləri görmürsünüzmü? Bəlkə, Rəbbiniz yanında sizin tərəfinizi saxlayan bir adam tapasınız?" İnsanların bəzisi digərlərinə deyəcək: "Gərək Adəmdən xahiş edəsiniz!" Onlar Adəmin عليه السلام yanına gəlib deyəcəklər: "Sən bəşəriyyətin atasısan! Özünü də Allah Öz Əlləri ilə yaratmış, Öz ruhundan sənə üfürmüş və mələklər Onun əmri ilə sənə səcdə etmişlər. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et (şəfaətçi ol)! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!" Adəm deyəcək: "Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Çünki O mənə (bəlli) bir ağaca yaxınlaşmağı qadağan etdi, lakin

mən Ona asi oldum. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Nuhun yanına!" Onda onlar Nuhun yanına gəlib deyəcəklər: "Ey Nuh! Sən yer üzünə göndərilmiş ilk elçisən. Özünü də Allah şükür edən bəndə adlandırmışdır. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!" Nuh deyəcək: "Bu gün qüdrətli və əzəmətli Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mənim dua etməyə imkanım var idi, lakin mən qövmümün əleyhinə bəddua etdim. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin İbrahimin yanına!" Onda onlar İbrahimin yanına gəlib deyəcəklər: "Ey İbrahim! Sən həm Allahın peyğəmbəri, həm də yer əhli arasında Allahın ən sevimli dostusan. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!" İbrahim deyəcək: "Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mən üç dəfə yalan danışmışam. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Musanın yanına!" Onda onlar Musanın yanına gəlib deyəcəklər: "Ey Musa! Sən, Allahın elçisisən, Allah Öz risaləti[1] ilə, üstəlik səninlə bilavasitə danışmaqla səni digər insanlardan üstün etmişdir. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!" Musa deyəcək: "Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mən adam öldürmüşəm. Halbuki, onu öldürmək mənə əmr edilməmişdi. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Məryəm oğlu İsanın yanına!" Onda onlar İsanın yanına gəlib deyəcəklər: "Ey İsa! Sən həm Allahın elçisi, həm Onun Məryəmə göndərdiyi Kəlməsi, həm də Onun ruhundansan. Sən hələ körpə ikən beşikdə insanlarla danışırdın. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!" İsa deyəcək: "Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O, bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir." İsa öz xətasını onlara bildirməyəcək, sadəcə belə deyəcək: "Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Muhəmmədin yanına!" Onda onlar Muhəmmədin yanına gəlib deyəcəklər: "Ey Muhəmməd! Sən həm Allahın elçisi, həm də peyğəmbərlərin sonuncususan. Allah sənin keçmiş və gələcək günahlarını bağışlamışdır. (Elə isə) Rəbbinin yanında bizdən ötrü havadarlıq et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!" Onda mən Ərşin altına gəlib, qüdrətli və əzəmətli Rəbbimin qarşısında səcdə edəcəyəm. Sonra Allah mənə elə təriflər və alqışlar göndərəcək ki, məndən əvvəl heç kəsə belə təriflər və alqışlar göndərməmişdir. Sonra da belə deyiləcək: "Ey Muhəmməd! Başını qaldır və istə, sənə istədiyin veriləcəkdir, havadarlıq et, havadarlığın qəbul olunacaqdır." Mən başımı qaldırıb deyəcəyəm: "Ümmətim, ey Rəbbim! Ümmətim, ey Rəbbim! Ümmətim, ey Rəbbim!" Onda belə deyiləcək: "Ey Muhəmməd, ümmətindən sorğu-suala çəkilməyəcək kimsələri Cənnətin sağ qapılarından içəri daxil et! Halbuki, onlar başqa insanlarla birlikdə (Cənnətin) digər qapılarından da keçə bilərlər."

---

[1] Musaya ﷺ həvalə etdiyi peyğəmbərlik vəzifəsi.

Peyğəmbər ﷺ demişdir: “Canım Əlində olan Allaha and olsun ki, Cənnət qapılarındakı laylardan hər iki lay arasındakı məsafə Məkkə ilə Himyər (yaxud Məkkə ilə Busra) arasındakı məsafə qədərdir.” (əl-Buxari, 4712)

## ٤٠– باب: قَوْلُهُ تَعَالَى: ﴿عَسَىٰٓ أَن يَبْعَثَكَ رَبُّكَ مَقَامًا مَّحْمُودًا﴾

## 40-cı fəsil. Uca Allahın: “...Ola bilsin ki, Rəbbin səni tərifəlayiq bir məqama yüksəltsin”[1]– sözü

١٧٤٥ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: إِنَّ النَّاسَ يَصِيرُونَ يَوْمَ الْقِيَامَةِ جُثًا كُلُّ أُمَّةٍ تَتْبَعُ نَبِيَّهَا يَقُولُونَ: يَا فُلَانُ اشْفَعْ، يَا فُلَانُ اشْفَعْ حَتَّى تَنْتَهِيَ الشَّفَاعَةُ إِلَى النَّبِيِّ ﷺ فَذَلِكَ يَوْمَ يَبْعَثُهُ اللَّهُ الْمَقَامَ الْمَحْمُودَ. [رواه البخاري: ٤٧١٨]

**1745.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: “Qiyamət günü insanlar dizləri üstə duracaq və hər ümmət öz peyğəmbərinin dalınca düşüb: “Ey filankəs, (bizə) havadarlıq et, ey filankəs, (bizə) havadarlıq et!”– deyə yalvaracaq. Nəhayət, havadarlıq etmək (Muhəmməd) Peyğəmbərə ﷺ həvalə ediləcəkdir. Həmin vaxt Allah onu tərifəlayiq məqama[2] gətirəcək.” (əl-Buxari, 4718)

## ٤١– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَلَا تَجْهَرْ بِصَلَاتِكَ وَلَا تُخَافِتْ بِهَا﴾

## 41-ci fəsil. Uca Allahın: “Namazını nə uca səslə, nə də pıçıltı ilə qıl. Bunların arasında orta bir yol tut”[3]– sözü

١٧٤٦ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما فِي قَوْلِهِ تَعَالَى: ﴿وَلَا تَجْهَرْ بِصَلَاتِكَ وَلَا تُخَافِتْ بِهَا﴾ قَالَ نَزَلَتْ وَرَسُولُ اللَّهِ ﷺ مُخْتَفٍ بِمَكَّةَ كَانَ إِذَا صَلَّى بِأَصْحَابِهِ رَفَعَ صَوْتَهُ بِالْقُرْآنِ فَإِذَا سَمِعَهُ الْمُشْرِكُونَ سَبُّوا الْقُرْآنَ وَمَنْ أَنْزَلَهُ وَمَنْ جَاءَ بِهِ فَقَالَ اللَّهُ تَعَالَى لِنَبِيِّهِ: ﴿وَلَا تَجْهَرْ بِصَلَاتِكَ﴾ أَيْ بِقِرَاءَتِكَ فَيَسْمَعَ الْمُشْرِكُونَ فَيَسُبُّوا الْقُرْآنَ: ﴿وَلَا تُخَافِتْ بِهَا﴾ عَنْ أَصْحَابِكَ فَلَا تُسْمِعُهُمْ: ﴿وَابْتَغِ بَيْنَ ذَلِكَ سَبِيلًا﴾. [رواه البخاري: ٤٧٢٢]

**1746.** İbn Abbas رضي الله عنهما Uca Allahın: **“Namazını nə uca səslə, nə də pıçıltı ilə qıl...”** ayəsini izah edib demişdir: “Bu ayə Peyğəmbər ﷺ Məkkədə gizlin dəvət apardığı zaman nazil olmuşdur. O, əshabələri ilə birlikdə namaz qılarkən Quranı uca səslə oxuyardı. Müşriklər də bunu eşitdikdə həm Quranı, həm onu nazil edəni, həm də onu təbliğ edəni söyərdilər. Onda uca Allah Peyğəmbərinə ﷺ bu ayəni nazil etdi: **“Namazını nə uca səslə qıl”** yoxsa müşriklər sənin oxuduğunu eşidib, Quranı təhqir etsinlər, **“nə də pıçıltı ilə”** (oxu) yoxsa sənin nə oxuduğunu eşitməzlər. **“Bunların arasında orta bir yol tut.”** (əl-Buxari, 4722)

---

[1] “əl-İsra” surəsi, 79.

[2] Bu məqam ərəbcə: “Məqamul-məhmud” adlanır.

[3] “əl-İsra” surəsi, 110.

# سُورَةُ الكَهْفِ

# Kəhf surəsi

## ٤٢– باب: قَوْلُهُ تَعَالَى:

﴿أُوْلَٰٓئِكَ ٱلَّذِينَ كَفَرُواْ بِـَٔايَٰتِ رَبِّهِمۡ وَلِقَآئِهِۦ فَحَبِطَتۡ أَعۡمَٰلُهُمۡ﴾

## 42-ci fəsil. Uca Allahın: "Onlar Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını inkar edən, buna görə də bütün əməlləri boşa çıxan kimsələrdir"[1]– sözü

١٧٤٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ إِنَّهُ لَيَأْتِي الرَّجُلُ الْعَظِيمُ السَّمِينُ يَوْمَ الْقِيَامَةِ لاَ يَزِنُ عِنْدَ اللَّهِ جَنَاحَ بَعُوضَةٍ وَقَالَ اقْرَءُوا: ﴿فَلَا نُقِيمُ لَهُمۡ يَوۡمَ ٱلۡقِيَٰمَةِ وَزۡنٗا﴾. [رواه البخاري: ٤٧٢٩]

**1747.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü yekəpər şişman bir adam gələcək. Allahın hüzurunda (həmin adamın) heç mığmığanın qanadı qədər ağırlığı olmayacaq. (Bu ayəni) oxuyun: **"Odur ki, Qiyamət günü Biz onlara əhəmiyyət verməyəcəyik."** (əl-Buxari, 4729)

# سُورَةُ مَرْيَمَ

# Məryəm surəsi

## ٤٣– باب: قَوْلُهُ تَعَالَى:

﴿وَأَنذِرۡهُمۡ يَوۡمَ ٱلۡحَسۡرَةِ﴾

## 43-cü fəsil. Uca Allahın: "Sən onları işin bitmiş olacağı peşmançılıq günü ilə qorxut!"[2] sözü

١٧٤٨ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: يُؤْتَى بِالْمَوْتِ كَهَيْئَةِ كَبْشٍ أَمْلَحَ فَيُنَادِي مُنَادٍ يَا أَهْلَ الْجَنَّةِ فَيَشْرَئِبُّونَ وَيَنْظُرُونَ فَيَقُولُ هَلْ تَعْرِفُونَ هَذَا فَيَقُولُونَ نَعَمْ هَذَا الْمَوْتُ وَكُلُّهُمْ قَدْ رَآهُ ثُمَّ يُنَادِي يَا أَهْلَ النَّارِ فَيَشْرَئِبُّونَ وَيَنْظُرُونَ فَيَقُولُ هَلْ تَعْرِفُونَ هَذَا فَيَقُولُونَ نَعَمْ هَذَا الْمَوْتُ وَكُلُّهُمْ قَدْ رَآهُ فَيُذْبَحُ ثُمَّ يَقُولُ يَا

[1] **"De: "Sizə əməlləri baxımından ən çox ziyana uğrayanlar barəsində xəbər verimmi? O kəslər haqqında ki, onların dünya həyatındakı səyləri boşa çıxmışdır. Çünki onlar özlüyündə yaxşı işlər gördükləri gümanında idilər. Onlar Rəbbinin ayələrini və Onunla qarşılaşacaqlarını inkar edən, buna görə də bütün əməlləri boşa çıxan kimsələrdir. Odur ki, Qiyamət günü Biz onlara əhəmiyyət verməyəcəyik."** "əl-Kəhf" surəsi, 103-105.

[2] "Məryəm" surəsi, 39.

أَهْلَ الْجَنَّةِ خُلُودٌ فَلاَ مَوْتَ وَيَا أَهْلَ النَّارِ خُلُودٌ فَلاَ مَوْتَ ثُمَّ قَرَأَ: ﴿وَأَنذِرْهُمْ يَوْمَ الْحَسْرَةِ إِذْ قُضِيَ الْأَمْرُ وَهُمْ فِي غَفْلَةٍ﴾ وَهَؤُلاَءِ فِي غَفْلَةٍ أَهْلُ الدُّنْيَا: ﴿وَهُمْ لَا يُؤْمِنُونَ﴾. [رواه البخاري: ٤٧٣٠]

**1748.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Qiyamət günü) ölüm ağlı-qaralı, buynuzlu qoç şəklində gətiriləcək. Sonra carçı: "Ey Cənnət əhli!"– deyə çağıracaq. Cənnət əhli başlarını qaldırıb ona tərəf baxacaqlar. Carçı: "Bunu tanıyırsınızmı?"– deyə soruşacaq. Onlar: "Bəli, bu ölümdür!"– deyə cavab verəcəklər. Çünki onların hamısı ölümü görmüşdülər. Sonra carçı: "Ey Cəhənnəm əhli!"– deyə səsləyəcək. Cəhənnəm əhli başlarını qaldırıb ona tərəf baxacaqlar. Carçı: "Bunu tanıyırsınızmı?"– deyə soruşacaq. Onlar: "Bəli, bu ölümdür!"– deyə cavab verəcəklər. Çünki onların hamısı ölümü görmüşdülər. Bundan sonra ölümün (başını) kəsəcəklər. Sonra (onlara) deyiləcək: "Ey Cənnət əhli, siz əbədi yaşayacaq və heç vaxt ölməyəcəksiniz! Ey Cəhənnəm əhli, siz də əbədi yaşayacaq və heç vaxt ölməyəcəksiniz!"

Sonra Peyğəmbər ﷺ: **"Onları işin bitmiş olacağı peşmançılıq günü ilə qorxut! Çünki onlar qəflətdədirlər..."** ayəsini oxudu və: "Bu dünyanın sakinləri xəbərsizdirlər"– dedi, sonra da davam etdi və: **"və iman gətirmirlər"**– deyərək ayəni tamamladı." (əl-Buxari, 4730)

# سُورَةُ النُّورِ

# ən-Nur surəsi

## ٤٤– باب: قَوْلُهُ تَعَالَى:

﴿وَالَّذِينَ يَرْمُونَ أَزْوَاجَهُمْ وَلَمْ يَكُن لَّهُمْ شُهَدَاءُ إِلَّا أَنفُسُهُمْ﴾

## 44-cü fəsil.
## Uca Allahın: "Arvadlarını *zinada* günahlandırıb özlərindən başqa şahidləri olmayanların..."[1] sözü

١٧٤٩ – عَنْ سَهْلِ بْنِ سَعْد ﷺ أَنَّ عُوَيْمِرًا أَتَى عَاصِمَ بْنَ عَدِيٍّ وَكَانَ سَيِّدَ بَنِي عَجْلاَنَ فَقَالَ: كَيْفَ تَقُولُونَ فِي رَجُلٍ وَجَدَ مَعَ امْرَأَتِهِ رَجُلاً أَيَقْتُلُهُ فَتَقْتُلُونَهُ أَمْ كَيْفَ يَصْنَعُ سَلْ لِي رَسُولَ اللَّهِ ﷺ عَنْ ذَلِكَ فَأَتَى عَاصِمٌ النَّبِيَّ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ، فَكَرِهَ رَسُولُ اللَّهِ ﷺ الْمَسَائِلَ فَسَأَلَهُ عُوَيْمِرٌ فَقَالَ: إِنَّ رَسُولَ اللَّهِ ﷺ كَرِهَ الْمَسَائِلَ وَعَابَهَا قَالَ عُوَيْمِرٌ: وَاللَّهِ لاَ أَنْتَهِي حَتَّى أَسْأَلَ رَسُولَ اللَّهِ ﷺ عَنْ ذَلِكَ فَجَاءَ عُوَيْمِرٌ فَقَالَ: يَا رَسُولَ اللَّهِ رَجُلٌ وَجَدَ مَعَ امْرَأَتِهِ رَجُلاً أَيَقْتُلُهُ فَتَقْتُلُونَهُ أَمْ كَيْفَ يَصْنَعُ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ قَدْ أَنْزَلَ اللَّهُ الْقُرْآنَ فِيكَ وَفِي صَاحِبَتِكَ فَأَمَرَهُمَا رَسُولُ اللَّهِ ﷺ بِالْمُلاَعَنَةِ بِمَا سَمَّى اللَّهُ فِي كِتَابِهِ فَلاَعَنَهَا ثُمَّ قَالَ: يَا رَسُولَ اللَّهِ إِنْ

[1] Ardı: **"...hər birinin şahidliyi, özünün doğru danışanlardan olmasına dair dörd dəfə Allahı şahid tutması, beşinci dəfə isə: "Əgər yalan danışanlardandırsa, Allah ona lənət eləsin!"– *deməsidir.*"** "ən-Nur" surəsi, 6-7.

حَبَسْتُهَا فَقَدْ ظَلَمْتُهَا فَطَلَّقَهَا فَكَانَتْ سُنَّةً لِمَنْ كَانَ بَعْدَهُمَا فِي الْمُتَلاَعِنَيْنِ ثُمَّ قَالَ رَسُولُ اللَّهِ ﷺ انْظُرُوا فَإِنْ جَاءَتْ بِهِ أَسْحَمَ أَدْعَجَ الْعَيْنَيْنِ عَظِيمَ الأَلْيَتَيْنِ خَدَلَّجَ السَّاقَيْنِ فَلاَ أَحْسِبُ عُوَيْمِرًا إِلاَّ قَدْ صَدَقَ عَلَيْهَا وَإِنْ جَاءَتْ بِهِ أُحَيْمِرَ كَأَنَّهُ وَحَرَةٌ فَلاَ أَحْسِبُ عُوَيْمِرًا إِلاَّ قَدْ كَذَبَ عَلَيْهَا فَجَاءَتْ بِهِ عَلَى النَّعْتِ الَّذِي نَعَتَ بِهِ رَسُولُ اللَّهِ ﷺ مِنْ تَصْدِيقِ عُوَيْمِرٍ فَكَانَ بَعْدُ يُنْسَبُ إِلَى أُمِّهِ. [رواه البخاري: ٤٧٤٥]

**1749.** Səhl ibn Səd ﷺ rəvayət etmişdir ki, (bir dəfə) Uveymir ﷺ Bəni İclan tayfasının başçısı Asim ibn Adiyin yanına gəlib soruşdu: “Bir adam öz zövcəsini başqa bir kişi ilə zina edərkən tutsa, nə etməlidir? O həmən kişini öldürməli, siz də onu öldürməlisiniz? Yoxsa bunun başqa bir yolu var? Bu haqda mənə aydınlıq gətirmək üçün bunu Allahın elçisindən soruş.” Asim Peyğəmbərin ﷺ yanına gəlib: “Ey Allahın elçisi!”– deyə (bu haqda ondan soruşdu), lakin bu suallar Peyğəmbərin ﷺ xoşuna gəlmədi, bunu ayıb hesab etdi. Uveymir bunun cavabını Asimdən soruşduqda, o dedi: “Sənin sualların Peyğəmbərin ﷺ xoşuna gəlmədi və o bunu ayıb hesab etdi.” Uveymir dedi: “Vallahi, gedib özüm bu barədə Peyğəmbərdən ﷺ soruşacağam!” Sonra Uveymir Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah, bir adam öz zövcəsini başqa bir kişi ilə zina edərkən tutsa, onu öldürməli, siz də onu öldürməlisinizmi? Yoxsa bunun başqa bir yolu var?” Peyğəmbər ﷺ buyurdu: “Artıq Allah sənin və sənin zövcən barədə ayə nazil etdi!” Sonra Peyğəmbər ﷺ onlara Allahın Kitabında olduğu kimi lənətləşməyi əmr etdi. Onlar Peyğəmbərin ﷺ əmrini yerinə yetirdikdən sonra Uveymir: “Ya Rəsulullah, mən onu boşamasam, ona zülm etmiş olaram”– dedi və onu boşadı. Bundan sonra bu hökm sünnə olaraq, hər bir lənətləşən ər-arvada tətbiq olundu. Sonra Peyğəmbər ﷺ buyurdu: “Gözdə-qulaqda olun, əgər doğulacaq uşaq qara dərili, qaragözlü, iri yanlı və kök baldırlı olarsa, mən Uveymirin o qadının əleyhinə dediyinin həqiqət olduğunu hesab edərəm. Yox, əgər uşaq qırmızı dərili, cılız doğulmuş olarsa, mən Uveymirin öz zövcəsinə böhtan və iftira atdığını sanaram.” (Vaxtı yetişdikdə) qadın Peyğəmbərin ﷺ vəsf etdiyi şəkildə olan və Uveymirin haqlı olduğunu sübut edən bir uşaq dünyaya gətirdi. Bu səbəbdən də uşaq anasına mənsub oldu.” (əl-Buxari, 4745)

## ٤٥– باب: قَوْلُهُ تَعَالَى:

﴿ وَيَدْرَؤُا عَنْهَا الْعَذَابَ أَنْ تَشْهَدَ أَرْبَعَ شَهَادَاتٍ بِاللَّهِ إِنَّهُ لَمِنَ الْكَاذِبِينَ ﴾

## 45-ci fəsil.
## Uca Allahın: “Qadının da ərinin yalan danışanlardan olduğuna dair dörd dəfə Allahı şahid tutması cəzanı ondan dəf edər”[1]– sözü

**١٧٥٠** – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ هِلاَلَ بْنَ أُمَيَّةَ قَذَفَ امْرَأَتَهُ عِنْدَ النَّبِيِّ ﷺ بِشَرِيكِ ابْنِ سَحْمَاءَ فَقَالَ النَّبِيُّ ﷺ الْبَيِّنَةَ أَوْ حَدٌّ فِي ظَهْرِكَ فَقَالَ يَا رَسُولَ اللَّهِ إِذَا رَأَى أَحَدُنَا عَلَى امْرَأَتِهِ رَجُلاً يَنْطَلِقُ يَلْتَمِسُ الْبَيِّنَةَ فَجَعَلَ النَّبِيُّ ﷺ

[1] “ən-Nur” surəsi, 8.

يَقُولُ الْبَيِّنَةَ وَإِلاَّ حَدٌّ فِي ظَهْرِكَ فَقَالَ هِلاَلٌ وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ إِنِّي لَصَادِقٌ فَلَيُنْزِلَنَّ اللَّهُ مَا يُبَرِّئُ ظَهْرِي مِنَ الْحَدِّ فَنَزَلَ جِبْرِيلُ وَأَنْزَلَ عَلَيْهِ: ﴿وَٱلَّذِينَ يَرۡمُونَ أَزۡوَٰجَهُمۡ﴾ فَقَرَأَ حَتَّى بَلَغَ ﴿إِن كَانَ مِنَ ٱلصَّٰدِقِينَ﴾ فَانْصَرَفَ النَّبِيُّ ﷺ فَأَرْسَلَ إِلَيْهَا فَجَاءَ هِلاَلٌ فَشَهِدَ وَالنَّبِيُّ ﷺ يَقُولُ إِنَّ اللَّهَ يَعْلَمُ أَنَّ أَحَدَكُمَا كَاذِبٌ فَهَلْ مِنْكُمَا تَائِبٌ ثُمَّ قَامَتْ فَشَهِدَتْ فَلَمَّا كَانَتْ عِنْدَ الْخَامِسَةِ وَقَّفُوهَا وَقَالُوا إِنَّهَا مُوجِبَةٌ قَالَ ابْنُ عَبَّاسٍ: فَتَلَكَّأَتْ وَنَكَصَتْ حَتَّى ظَنَنَّا أَنَّهَا تَرْجِعُ ثُمَّ قَالَتْ لاَ أَفْضَحُ قَوْمِي سَائِرَ الْيَوْمِ فَمَضَتْ فَقَالَ النَّبِيُّ ﷺ أَبْصِرُوهَا فَإِنْ جَاءَتْ بِهِ أَكْحَلَ الْعَيْنَيْنِ سَابِغَ الأَلْيَتَيْنِ خَدَلَّجَ السَّاقَيْنِ فَهُوَ لِشَرِيكِ ابْنِ سَحْمَاءَ فَجَاءَتْ بِهِ كَذَلِكَ فَقَالَ النَّبِيُّ صَلَّى اللَّهُ عَلَيْهِ وَسَلَّمَ لَوْلاَ مَا مَضَى مِنْ كِتَابِ اللَّهِ لَكَانَ لِي وَلَهَا شَأْنٌ. [رواه البخاري: ٤٧٤٧]

**1750.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Hilal ibn Umeyyə رضي الله عنه Peyğəmbərin ﷺ yanına gəlib, zövcəsini Şureyk ibn Səhma ilə zina etməkdə günahlandırdı. Peyğəmbər ﷺ dedi: "Ya dediyini sübuta yetir, ya da qamçılanacaqsan." Hilal dedi: "Ya Rəsulullah, bəyəm bizdən birimiz arvadını yataqda başqa bir kişi ilə gördükdə gedib sübut axtarmalıdır?" Peyğəmbər ﷺ (yenə) buyurdu: "Ya dediyini sübuta yetir, ya da qamçılanacaqsan." Hilal dedi: "Səni haqq ilə göndərən Allaha and olsun ki, mən doğru danışıram və Allah məni belə bir cəzadan qurtarmaq üçün ayə nazil edəcək." Elə bu vaxt Cəbrail عليه السلام yerə enib bu ayəni Peyğəmbərə ﷺ vəhy etdi: **"Arvadlarını *zinada* günahlandırıb özlərindən başqa şahidləri olmayanların hər birinin şahidliyi, özünün doğru danışanlardan olmasına dair dörd dəfə Allahı şahid tutması, beşinci dəfə isə: "Əgər yalan danışanlardandırsa, Allah ona lənət eləsin!"– *deməsidir*. Qadının da ərinin yalan danışanlardan olduğuna dair dörd dəfə Allahı şahid tutması cəzanı ondan dəf edər"[1].** Bundan sonra Peyğəmbər ﷺ çıxıb getdi, qadının da yanına bir nəfər göndərib, onu çağırtdırdı. (Qadın əri) Hilal رضي الله عنه ilə birgə Peyğəmbərin ﷺ hüzuruna gəldi və Peyğəmbər ﷺ buyurdu: "Heç şübhəsiz ki, Allah sizdən birinizin yalan danışdığını bilir. Aranızda tövbə etmək istəyən yoxdurmu?" Bundan sonra qadın ayağa qalxıb ərinin yalan danışmasına dair dörd dəfə şəhadət verdi. Beşinci dəfə şəhadət vermək istədikdə, yanındakılar onu dayandırıb dedilər: "Bu sonuncu şəhadətin sənin başına bəla gətirə bilər ha!" Qadın bir anlıq tərəddüd etdi və fikrindən dönmək istədi, hətta biz onun bu inadkarlıqdan əl çəkəcəyini zənn etdik. Sonra qadın: "Mən heç vaxt qövmümü rüsvay etməyəcəyəm"– deyib, (lənətləşməni başa çatdırdı və) çıxıb getdi. Peyğəmbər ﷺ buyurdu: "Bu qadına göz yetirin, əgər o, qara göz, iri yanlı və kök baldırlı bir uşaq dünyaya gətirsə, demək, uşaq Şureyk ibn Səhmadandır!" Qadın Peyğəmbərin ﷺ vəsf etdiyi şəkildə bir uşaq dünyaya gətirdi. Sonra Peyğəmbər ﷺ buyurdu: "Allahın Öz Kitabında nazil etdiyi hökm olmasaydı, o qadınla hesablaşardım (onu daşqalaq edərdim)" (əl-Buxari, 4747)

[1] "ən-Nur" surəsi, 6-9.

# سُورَةُ الفُرْقَانِ

## əl-Furqan surəsi

### ٤٦– باب: قَوْلُهُ تَعَالَى: ﴿ٱلَّذِينَ يُحْشَرُونَ عَلَىٰ وُجُوهِهِمْ إِلَىٰ جَهَنَّمَ﴾

### 46-cı fəsil.
### Uca Allahın: "Üzüstə sürüklənib Cəhənnəmə toplanılacaq kimsələr – məhz onlar yerləri ən pis olan, *haqq* yoldan ən çox azan kimsələrdir"[1]– sözü

١٧٥١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّ رَجُلاً قَالَ: يَا نَبِيَّ اللَّهِ يُحْشَرُ الْكَافِرُ عَلَى وَجْهِهِ يَوْمَ الْقِيَامَةِ؟ قَالَ: أَلَيْسَ الَّذِي أَمْشَاهُ عَلَى الرِّجْلَيْنِ فِي الدُّنْيَا قَادِرًا عَلَى أَنْ يُمْشِيَهُ عَلَى وَجْهِهِ يَوْمَ الْقِيَامَةِ. [رواه البخاري: ٤٧٦٠]

**1751.** Ənəs ibn Malik ﷺ rəvayət etmişdir ki, (bir dəfə) bir nəfər soruşdu: "Ey Allahın peyğəmbəri! Qiyamət günü kafirlər üzüstə sürüklənib məhşərə necə toplanacaqlar? Peyğəmbər ﷺ buyurdu: "Onu bu dünyada iki ayağı üstə yeritməyə qadir olan Allah, Qiyamət günü üzüstə yeridə bilməzmi?!" (əl-Buxari, 4760)

# سُورَةُ الرُّومِ

## ər-Rum surəsi

### ٤٧– باب: قَوْلُهُ تَعَالَى: ﴿الٓمٓ ۝١ غُلِبَتِ ٱلرُّومُ ۝٢﴾

### 47-ci fəsil. Uca Allahın: "Əlif. Ləm. Mim. Rumlular məğlub edildilər"[2]– sözü

١٧٥٢ – عَنْ مَسْرُوقٍ قَالَ: بَيْنَمَا رَجُلٌ يُحَدِّثُ فِي كِنْدَةَ فَقَالَ: يَجِيءُ دُخَانٌ يَوْمَ الْقِيَامَةِ فَيَأْخُذُ بِأَسْمَاعِ الْمُنَافِقِينَ وَأَبْصَارِهِمْ يَأْخُذُ الْمُؤْمِنَ كَهَيْئَةِ الزُّكَامِ فَفَزِعْنَا فَأَتَيْتُ ابْنَ مَسْعُودٍ وَكَانَ مُتَّكِئًا فَغَضِبَ فَجَلَسَ فَقَالَ مَنْ عَلِمَ فَلْيَقُلْ وَمَنْ لَمْ يَعْلَمْ فَلْيَقُلِ اللَّهُ أَعْلَمُ فَإِنَّ مِنَ الْعِلْمِ أَنْ يَقُولَ لِمَا لاَ يَعْلَمُ لاَ أَعْلَمُ فَإِنَّ اللَّهَ قَالَ لِنَبِيِّهِ ﷺ: ﴿قُلْ مَآ أَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ أَجْرٍ وَمَآ أَنَا۠ مِنَ ٱلْمُتَكَلِّفِينَ﴾ وَإِنَّ قُرَيْشًا أَبْطَئُوا عَنِ الإِسْلاَمِ فَدَعَا عَلَيْهِمُ النَّبِيُّ ﷺ فَقَالَ: اللَّهُمَّ أَعِنِّي عَلَيْهِمْ بِسَبْعٍ كَسَبْعِ يُوسُفَ فَأَخَذَتْهُمْ سَنَةٌ حَتَّى هَلَكُوا فِيهَا وَأَكَلُوا الْمَيْتَةَ وَالْعِظَامَ وَيَرَى الرَّجُلُ مَا بَيْنَ السَّمَاءِ وَالأَرْضِ كَهَيْئَةِ الدُّخَانِ فَجَاءَهُ أَبُو سُفْيَانَ فَقَالَ يَا مُحَمَّدُ جِئْتَ تَأْمُرُنَا بِصِلَةِ الرَّحِمِ وَإِنَّ قَوْمَكَ قَدْ هَلَكُوا فَادْعُ

---

[1] "əl-Furqan" surəsi, 34.
[2] "ər-Rum" surəsi, 1-2.

اللَّهَ فَقَرَأَ: ﴿ فَٱرْتَقِبْ يَوْمَ تَأْتِى ٱلسَّمَآءُ بِدُخَانٍ مُّبِينٍ ﴾ إِلَى قَوْلِهِ: ﴿عَآئِدُونَ ﴾ أَفَيُكْشَفُ عَنْهُمْ عَذَابُ الآخِرَةِ إِذَا جَاءَ ثُمَّ عَادُوا إِلَى كُفْرِهِمْ فَذَلِكَ قَوْلُهُ تَعَالَى: ﴿ يَوْمَ نَبْطِشُ ٱلْبَطْشَةَ ٱلْكُبْرَىٰٓ ﴾ يَوْمَ بَدْرٍ وَ: ﴿لِزَامًۢا ﴾ يَوْمَ بَدْرٍ: ﴿الٓمٓ ۝١ غُلِبَتِ ٱلرُّومُ ۝٢ ﴾ إِلَى ﴿سَيَغْلِبُونَ ﴾ وَالرُّومُ قَدْ مَضَى. [رواه البخاري: ٤٧٧٤]

**1752.** Məsruq rəvayət edir ki, bir nəfər Kində qəbiləsindən olan adamlarla söhbət edərkən dedi: “Qiyamət günü elə bir tüstü əmələ gələcək ki, o, münafiqlərin qulaqlarını kar, gözlərini kor edəcək. Möminlər isə sadəcə zökəm xəstəliyinə tutulacaqlar.” Biz təşvişə düşdük. Mən ibn Məsudun yanına gəlib bu haqda ona xəbər verdim. İbn Məsud qəzəbləndi, sonra da söykəndiyi yerdən qalxıb oturdu və dedi: “Qoy bilənlər danışsın, bilməyənlər isə: “Doğrusunu Allah bilir!”– desinlər. Çünki bilmədiyin bir şeyə "bilmirəm" deməyin özü elmli olmaq deməkdir.

Allah Öz peyğəmbərinə ﷺ demişdir: **“De: “Mən buna görə sizdən heç bir mükafat istəmirəm və mən özümdən bir şey uydurmağa çalışmıram.”**[1] Lakin qureyşlilər (o zaman) hələ İslam dinini qəbul etmək fikrində deyildilər. Peyğəmbər ﷺ də onlara belə bəddua etdi: “Allahım, onlara qarşı mənə kömək et və onlara, Yusufun zamanında göndərdiyin yeddi (qıtlıq və quraqlıq) illəri kimi illər göndər!” Sonra onlara elə bir quraqlıq üz verdi ki, onlar məhv olmağa, ölmüş heyvan və sümük yeməyə başladılar. Adam yerlə göy arasında tüstüyə bənzər şeylər görürdü. Həmin vaxt Əbu Süfyan gəlib dedi: “Ey Muhəmməd, sən bizə qohumluq əlaqələrini möhkəmləndirməyi buyurursan, lakin sənin həmqəbilələrin həlak olur. (Bizim üçün) Allaha dua et!”

(İbn Məsud bu ayələri) oxudu: **“Sən göydən aşkar bir tüstü gələcəyi günü gözlə. O *tüstü ki,* insanları bürüyəcəkdir. Bu, ağrılı-acılı bir əzabdır. *Onlar:* “Ey Rəbbimiz! Bizi bu əzabdan qurtar, biz də iman gətirək”– deyəcəklər. Onlar necə öyüd-nəsihət eşidə bilərlər ki, artıq onlara açıq-aşkar bir peyğəmbər gəlsə də, onlar ondan üz çevirib: “Öyrədilmiş bir dəlidir!”– dedilər. Biz əzabı bir az sizdən uzaqlaşdıraraq, amma siz yenə *azğınlığa* qayıdacaqsınız.”**[2] Əcəba, onlar axirət əzabından qurtula biləcəklər ki, küfrə də qayıtsınlar?! Uca Allah (bu xüsusda) buyurur: ***“Kafirləri* böyük bir müsibətlə yaxalayacağımız gün, Biz *onlardan* intiqam alacağıq.”**[3] Bu, artıq Bədr döyüşündə baş vermişdir. Həmçinin O buyurur: **“Siz *haqqı* yalan saydınız. Ona görə də *əzab sizi* rahat buraxmayacaqdır!”**[4] Bu da, artıq Bədr döyüşündə baş vermişdir. Həmçinin, O buyurur: **“Əlif. Ləm. Mim. Rumlular məğlub edildilər, ən aşağı (və ya ən yaxın) bir yerdə. Lakin onlar öz məğlubiyyətlərindən sonra tezliklə qələbə çalacaqlar”**[5] Rumluların da başına gələnlər artıq olub keçmişdir.” (əl-Buxari, 4774)

---

[1] “Sad” surəsi, 86.
[2] “əd-Duxan” surəsi, 10-15.
[3] “əd-Duxan” surəsi, 16.
[4] “əl-Furqan” surəsi, 77.
[5] “ər-Rum” surəsi, 1-3.

## سُورَةُ السَّجْدَةِ

## əs-Səcdə surəsi

### ٤٨– باب: قَوْلُهُ تَعَالَى: ﴿ فَلَا تَعْلَمُ نَفْسٌ مَّآ أُخْفِىَ لَهُم مِّن قُرَّةِ أَعْيُنٍ ﴾

### 48-ci fəsil.
### Uca Allahın: "Etdikləri əməllərin mükafatı kimi, onlar üçün gözlərinə sevinc gətirəcək nələr saxlandığını heç kəs bilmir"[1]– sözü

١٧٥٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: قَالَ اللَّهُ تَبَارَكَ وَتَعَالَى أَعْدَدْتُ لِعِبَادِي الصَّالِحِينَ مَا لاَ عَيْنٌ رَأَتْ وَلاَ أُذُنٌ سَمِعَتْ وَلاَ خَطَرَ عَلَى قَلْبِ بَشَرٍ قَالَ أَبُو هُرَيْرَةَ اقْرَءُوا إِنْ شِئْتُمْ: ﴿ فَلَا تَعْلَمُ نَفْسٌ مَّآ أُخْفِىَ لَهُم مِّن قُرَّةِ أَعْيُنٍ جَزَآءً بِمَا كَانُواْ يَعْمَلُونَ ﴾. [رواه البخاري: ٤٧٧٤]

**1753.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Uca Allah buyurur: "Mən əməlisaleh qullarım üçün heç bir gözün görmədiyi, heç bir qulağın eşitmədiyi və heç bir (insanın) qəlbindən keçirmədiyi nemətlər hazırlamışam."
Sonra Əbu Hureyra ﷺ dedi: "İstəyirsinizsə, (bu ayəni) oxuyun: **"Etdikləri əməllərin mükafatı kimi, onlar üçün gözlərinə sevinc gətirəcək nələr saxlandığını heç kəs bilmir."** (əl-Buxari, 4780)

## سُورَةُ الأَحْزَابِ

## əl-Əhzab surəsi

### ٤٩– باب: قَوْلُهُ تَعَالَى: ﴿ تُرْجِى مَن تَشَآءُ مِنْهُنَّ وَتُـْٔوِىٓ إِلَيْكَ مَن تَشَآءُ ﴾

### 49-cu fəsil. Uca Allahın:
### "Onlardan istədiyinin *səninlə gecələmək* növbəsini təxirə sala bilərsən, istədiyini də öz yanına ala bilərsən..."[2] sözü

١٧٥٤ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: كُنْتُ أَغَارُ عَلَى اللاَّتِي وَهَبْنَ أَنْفُسَهُنَّ لِرَسُولِ اللَّهِ ﷺ وَأَقُولُ أَتَهَبُ الْمَرْأَةُ نَفْسَهَا فَلَمَّا أَنْزَلَ اللَّهُ تَعَالَى: ﴿ تُرْجِى مَن تَشَآءُ مِنْهُنَّ وَتُـْٔوِىٓ إِلَيْكَ مَن تَشَآءُ وَمَنِ ٱبْتَغَيْتَ مِمَّنْ عَزَلْتَ فَلَا جُنَاحَ عَلَيْكَ ﴾ قُلْتُ مَا أُرَى رَبَّكَ إِلاَّ يُسَارِعُ فِي هَوَاكَ. [رواه البخاري: ٤٧٨٨]

---

[1] "əs-Səcdə" surəsi, 17.

[2] "əl-Əhzab" surəsi, 51. Ayənin tamamı: **"...Özündən ayırdıqlarından hansı birini *yenidən öz yanına almaq* istəsən, sənə heç bir günah olmaz. Bu, onların sevinmələri, kədərlənməmələri və sənin onlara verdiklərindən razı qalmaları üçün daha münasibdir. Allah qəlbinizdə olanları bilir. Allah Biləndir, Həlimdir."**

**1754.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən öz nəfsini Peyğəmbərə ﷺ bağışlayan (təmənnasız ona ərə getməyə razılıq verən) qadınları danlayıb deyərdim: "Heç qadın da öz nəfsini bağışlayarmı?" Sonra Uca Allah: **"Onlardan dilədiyinin *səninlə gecələmək* növbəsini təxirə sala bilərsən, dilədiyini də öz yanına ala bilərsən. Özündən ayırdıqlarından hansı birini *yenidən öz yanına almaq* istəsən, sənə heç bir günah olmaz..."** – ayəsini nazil etdikdə (mən Peyğəmbərə ﷺ) dedim: "Görürəm Rəbbin yalnız sənin istəyini tez yerinə yetirir." (əl-Buxari, 4788)

**١٧٥٥** – عَنْ عَائِشَةَ ﵂ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَسْتَأْذِنُ فِي يَوْمِ الْمَرْأَةِ مِنَّا بَعْدَ أَنْ أُنْزِلَتْ هَذِهِ الآيَةُ: ﴿تُرْجِى مَن تَشَآءُ مِنْهُنَّ وَتُـْٔوِىٓ إِلَيْكَ مَن تَشَآءُ ۖ وَمَنِ ٱبْتَغَيْتَ مِمَّنْ عَزَلْتَ فَلَا جُنَاحَ عَلَيْكَ ۚ﴾ فَقُلْتُ لَهَا: مَا كُنْتِ تَقُولِينَ قَالَتْ: كُنْتُ أَقُولُ لَهُ إِنْ كَانَ ذَاكَ إِلَيَّ فَإِنِّي لاَ أُرِيدُ يَا رَسُولَ اللَّهِ أَنْ أُوثِرَ عَلَيْكَ أَحَدًا. [رواه البخاري: ٤٧٧٩]

**1755.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "(Allahın) **"Onlardan dilədiyinin *səninlə gecələmək* növbəsini təxirə sala bilərsən, dilədiyini də öz yanına ala bilərsən. Özündən ayırdıqlarından hansı birini *yenidən öz yanına almaq* istəsən, sənə heç bir günah olmaz..."** ayəsi nazil olduqdan sonra Peyğəmbər ﷺ zövcələrindən birinin növbəsi olduğu zaman digərinin yanına getmək üçün bizdən izn istəyərdi."

(Muazə dedi): "Mən Aişədən soruşdum: "(O səndən izn istədikdə) nə deyirdin?" Aişə dedi: "Mən ona deyirdim: "Ya Rəsulullah, əgər bu (məsələ) mənim öhdəmə buraxılsaydı, yanına getmək istədiyin heç bir qadını özümdən üstün tutmazdım (və sənə onun yanına getməyə izn verməzdim)." (əl-Buxari, 4789)

## ٥٠ – باب:

## قَوْلُهُ تَعَالَى: ﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَدْخُلُوا۟ بُيُوتَ ٱلنَّبِىِّ إِلَّآ أَن يُؤْذَنَ لَكُمْ إِلَىٰ طَعَامٍ﴾

## 50-ci fəsil. Uca Allahın: "Ey iman gətirənlər! Sizə yeməyə izin verilməyib *süfrəyə dəvət olunmadıqca* Peyğəmbərin evlərinə girməyin..."[1]– sözü

**١٧٥٦** – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: خَرَجَتْ سَوْدَةُ بَعْدَمَا ضُرِبَ الْحِجَابُ لِحَاجَتِهَا وَكَانَتْ امْرَأَةً جَسِيمَةً لاَ تَخْفَى عَلَى مَنْ يَعْرِفُهَا فَرَآهَا عُمَرُ بْنُ الْخَطَّابِ فَقَالَ: يَا سَوْدَةُ أَمَا وَاللَّهِ مَا تَخْفَيْنَ عَلَيْنَا فَانْظُرِي كَيْفَ تَخْرُجِينَ قَالَتْ فَانْكَفَأَتْ رَاجِعَةً وَرَسُولُ اللَّهِ ﷺ فِي بَيْتِي وَإِنَّهُ لَيَتَعَشَّى وَفِي يَدِهِ عَرْقٌ فَدَخَلَتْ فَقَالَتْ: يَا رَسُولَ اللَّهِ

---

[1] "əl-Əhzab" surəsi, 53. Ayənin tamamı: **"...və *əvvəlcədən gəlib* yeməyin hazırlanmasını da gözləməyin. Lakin dəvət olunduqda girin və yemək yedikdən sonra bir-birinizlə söhbətə dalmadan dağılışın. Çünki bu *hərəkətiniz* Peyğəmbəri narahat edir və o sizdən utanır. Allah isə sözün açığını *sizə bəyan etməkdən* utanmır. *Peyğəmbərin* zövcələrindən bir şey istədikdə, pərdə arxasından istəyin. Bu həm sizin qəlbinizə, həm də onların qəlbinə daha çox saflıq gətirər. Sizə Allahın Elçisini narazı salmaq, vəfatından sonra onun həyat yoldaşları ilə izdivac etmək qətiyyən yolverilməzdir. Həqiqətən, bu, Allah yanında böyük günahdır."**

إِنِّي خَرَجْتُ لِبَعْضِ حَاجَتِي فَقَالَ لِي عُمَرُ كَذَا وَكَذَا قَالَتْ فَأَوْحَى اللَّهُ إِلَيْهِ ثُمَّ رُفِعَ عَنْهُ وَإِنَّ الْعَرْقَ فِي يَدِهِ مَا وَضَعَهُ فَقَالَ إِنَّهُ قَدْ أُذِنَ لَكُنَّ أَنْ تَخْرُجْنَ لِحَاجَتِكُنَّ. [رواه البخاري: ٤٧٩٥]

**1756.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Hicab ayəsi nazil olduqdan sonra (bir gün) Səudə ehtiyacı üzündən bayıra çıxdı. O, irigövdəli qadın olduğundan onu görən adam onu o saat tanıyardı. Ömər ibn Xəttab onu görüb dedi: "Ey Səudə, vallahi, biz səni tanıdıq. Bayıra çıxanda bax gör necə çıxırsan." Səudə geri qayıtdı. Həmin vaxt Peyğəmbər ﷺ mənim evimdə əlində sümüklü ət şam yeməyini yeyirdi. Səudə içəri daxil olub dedi: "Ya Rəsulullah! Mən ehtiyac üzündən bayıra çıxdım, lakin Ömər mənə belə-belə dedi." (Aişə) dedi: "Elə bu vaxt Allah Peyğəmbərə ﷺ vəhy nazil etdi. Vəhy tam nazil olduqda sümüklü ət hələ Peyğəmbərin ﷺ əlində idi, yerə qoymamışdı. Sonra Peyğəmbər ﷺ buyurdu: "Siz qadınlara ehtiyac üzündən bayıra çıxmağa izn verildi." (əl-Buxari, 4795)

## ٥١– باب: قَوْلُهُ تَعَالَى: ﴿ إِن تُبْدُوا۟ شَيْـًٔا أَوْ تُخْفُوهُ فَإِنَّ ٱللَّهَ كَانَ بِكُلِّ شَىْءٍ عَلِيمًا ﴾

## 51-ci fəsil. Uca Allahın: "Sizin bir şeyi aşkara çıxarmanızdan və ya gizli saxlamanızdan asılı olmayaraq, *bilin ki,* Allah hər şeyi bilir..."[1] sözü

١٧٥٧ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: اسْتَأْذَنَ عَلَيَّ أَفْلَحُ أَخُو أَبِي الْقُعَيْسِ بَعْدَمَا أُنْزِلَ الْحِجَابُ فَقُلْتُ لاَ آذَنُ لَهُ حَتَّى أَسْتَأْذِنَ فِيهِ النَّبِيَّ ﷺ فَإِنَّ أَخَاهُ أَبَا الْقُعَيْسِ لَيْسَ هُوَ أَرْضَعَنِي وَلَكِنْ أَرْضَعَتْنِي امْرَأَةُ أَبِي الْقُعَيْسِ فَدَخَلَ عَلَيَّ النَّبِيُّ ﷺ فَقُلْتُ لَهُ يَا رَسُولَ اللَّهِ إِنَّ أَفْلَحَ أَخَا أَبِي الْقُعَيْسِ اسْتَأْذَنَ فَأَبَيْتُ أَنْ آذَنَ لَهُ حَتَّى أَسْتَأْذِنَكَ فَقَالَ النَّبِيُّ ﷺ وَمَا مَنَعَكِ أَنْ تَأْذَنِي عَمُّكِ قُلْتُ يَا رَسُولَ اللَّهِ إِنَّ الرَّجُلَ لَيْسَ هُوَ أَرْضَعَنِي وَلَكِنْ أَرْضَعَتْنِي امْرَأَةُ أَبِي الْقُعَيْسِ فَقَالَ ائْذَنِي لَهُ فَإِنَّهُ عَمُّكِ تَرِبَتْ يَمِينُكِ. [رواه البخاري: ٤٧٩٧]

**1757.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Hicab ayəsi nazil olduqdan sonra (bir gün) Əbul Queysin qardaşı Əfləh içəri girmək üçün izn istədi. Mən (öz-özümə) dedim: "Mən Peyğəmbərdən ﷺ izn istəməyincə onu evə buraxmayacağam. Çünki mənə Əbul Queysin qardaşı deyil, onun zövcəsi süd vermişdir." Peyğəmbər ﷺ mənim yanıma gəldikdə dedim: "Ya Rəsulullah, Əbul Queysin qardaşı Əfləh içəri girmək üçün izn istədi, lakin mən sənin iznin olmadan onun içəri daxil olmasına razılıq vermədim." Peyğəmbər ﷺ dedi: "Niyə ona izn vermədin?! O ki sənin əmindir!" Mən dedim: "Ya Rəsulullah, axı mənə Əbul Queysin qardaşı deyil, onun zövcəsi süd vermişdir." Peyğəmbər ﷺ buyurdu: "Burax onu gəlsin, o, sənin əmindir, ay yazıq." (əl-Buxari, 4796)

---

[1] "əl-Əhzab" surəsi, 54-55. Tamamı: **"...Qadınlara ataları, oğulları, qardaşları, qardaşlarının oğulları, bacılarının oğulları, öz *müsəlman* qadınları, sahib olduqları kölə və cariyələrin yanında *hicab geyməmələrində* heç bir günah yoxdur. *Ey qadınlar,* Allahdan qorxun! Şübhəsiz ki, Allah hər şeyə şahiddir."**

## ٥٢- باب: قَوْلُهُ تَعَالَى:

﴿ إِنَّ ٱللَّهَ وَمَلَٰٓئِكَتَهُۥ يُصَلُّونَ عَلَى ٱلنَّبِيِّۚ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ صَلُّواْ عَلَيۡهِ وَسَلِّمُواْ تَسۡلِيمًا ﴾

## 52-ci fəsil. Uca Allahın: "Doğrudan da, Allah və Onun mələkləri Peyğəmbərə xeyir-dua verirlər. Ey iman gətirənlər! Siz də ona xeyir-dua verib kamil ədəb-ərkanla salamlayın"[1]– sözü

١٧٥٨ – عَنْ كَعْب بْنِ عُجْرَةَ ﷺ قِيلَ: يَا رَسُولَ اللَّه أَمَّا السَّلاَمُ عَلَيْكَ فَقَدْ عَرَفْنَاهُ فَكَيْفَ الصَّلاَةُ عَلَيْكَ قَالَ قُولُوا اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّد وَعَلَى آل مُحَمَّد كَمَا صَلَّيْتَ عَلَى آل إِبْرَاهيمَ إِنَّكَ حَميدٌ مَجيدٌ اللَّهُمَّ بَارِكْ عَلَى مُحَمَّد وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا بَارَكْتَ عَلَى آلِ إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ. [رواه البخاري: ٤٧٩٧]

**1758.** Kəb ibn Ucra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbərdən ﷺ soruşdular: "Ya Rəsulullah, biz sənə salamı necə verməyi bilirik. Bəs xeyir-duanı[2] sənə necə verək?" Peyğəmbər ﷺ buyurdu: "Deyin: "Allahummə salli alə Muhəmmədin və alə ali Muhəmməd, kəmə salleytə alə ali İbrahim, innəkə həmidun məcid. Allahummə barik alə Muhəmmədin və alə ali Muhəmməd, kəmə barəktə alə ali İbrahim, innəkə həmidun məcid"[3] (əl-Buxari, 4797)

١٧٥٩ – عَنْ أَبِي سَعِيد الْخُدْرِيِّ ﷺ قَالَ: قُلْنَا: يَا رَسُولَ اللَّه هَذَا التَّسْلِيمُ فَكَيْفَ نُصَلِّي عَلَيْكَ؟ قَالَ: قُولُوا اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّد عَبْدِكَ وَرَسُولِكَ كَمَا صَلَّيْتَ عَلَى آلِ إِبْرَاهِيمَ وَبَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا بَارَكْتَ عَلَى إِبْرَاهِيمَ. [رواه البخاري: ٤٧٩٨]

**1759.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "(Bir dəfə) biz dedik: "Ya Rəsulullah, biz sənə salamı necə verməyi bilirik. Bəs xeyir-duanı sənə necə verək?" Peyğəmbər ﷺ buyurdu: "Deyin: "Allahummə salli alə Muhəmmədin abdikə və rəsulikə kəmə salleytə alə ali İbrahimə və barik alə Muhəmmədin və alə ali Muhəmməd, kəmə barəktə alə İbrahimə."[4] (əl-Buxari, 4798)

## ٥٣- باب: قَوْلُهُ تَعَالَى: ﴿ لَا تَكُونُواْ كَٱلَّذِينَ ءَاذَوۡاْ مُوسَىٰ ﴾

## 53-cü fəsil. Uca Allahın: "...Musanı incidən şəxslərə oxşamayın..."[5]– sözü

١٧٦٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: إِنَّ مُوسَى كَانَ رَجُلاً حَيِيًّا وَذَلِكَ قَوْلُهُ تَعَالَى: ﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَا تَكُونُواْ كَٱلَّذِينَ ءَاذَوۡاْ مُوسَىٰ فَبَرَّأَهُ ٱللَّهُ مِمَّا قَالُواْۚ وَكَانَ عِندَ ٱللَّهِ وَجِيهًا ﴾. [رواه البخاري: ٤٧٩٩]

---

[1] "əl-Əhzab" surəsi, 56.

[2] Burada xeyir-dua deyildikdə salavat gətirmək nəzərdə tutulur.

[3] Tərcüməsi: Allahım, İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də xeyir-dua ver! Həqiqətən, Sən Tərifəlayiqsən, Şan-şöhrətlisən! Allahım, İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Həqiqətən, Sən Tərifəlayiqsən, Şan-şöhrətlisən!

[4] Tərcüməsi: Allahım, İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, qulun və rəsulun Muhəmmədə xeyir-dua ver, İbrahimə bərəkət verdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə bərəkət ver!

[5] "əl-Əhzab" surəsi, 69.

**1760.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həqiqətən də, Musa utancaq adam olmuşdur. Bu da uca Allahın: **"Ey iman gətirənlər! Musanı incidən şəxslərə oxşamayın. Allah onu onların dediklərindən təmizə çıxartdı. O, Allahın yanında çox ehtiram edilən şəxsdir"**[1]– sozlərində (öz təsdiqini tapmışdır) (əl-Buxari, 4799)

سُورَةُ سَبَإٍ

## Səba surəsi

### ٥٤– باب: قَوْلُهُ تَعَالَى: ﴿إِنْ هُوَ إِلَّا نَذِيرٌ لَّكُم بَيْنَ يَدَيْ عَذَابٍ شَدِيدٍ﴾

### 54-cü fəsil. Uca Allahın: "...O, şiddətli əzab gəlməzdən əvvəl sizi ancaq xəbərdar edəndir"[2]– sözü

١٧٦١ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: صَعِدَ النَّبِيُّ ﷺ الصَّفَا ذَاتَ يَوْمٍ فَقَالَ يَا صَبَاحَاهْ فَاجْتَمَعَتْ إِلَيْهِ قُرَيْشٌ قَالُوا: مَا لَكَ قَالَ أَرَأَيْتُمْ لَوْ أَخْبَرْتُكُمْ أَنَّ الْعَدُوَّ يُصَبِّحُكُمْ أَوْ يُمَسِّيكُمْ أَمَا كُنْتُمْ تُصَدِّقُونِي قَالُوا بَلَى قَالَ: فَإِنِّي نَذِيرٌ لَكُمْ بَيْنَ يَدَيْ عَذَابٍ شَدِيدٍ فَقَالَ: أَبُو لَهَبٍ تَبًّا لَكَ أَلِهَذَا جَمَعْتَنَا فَأَنْزَلَ اللَّهُ: ﴿تَبَّتْ يَدَا أَبِي لَهَبٍ﴾. [رواه البخاري: ٤٨٠١]

**1761.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ Səfa dağına qalxıb: "Düşmən gəlir!"– deyə (uca səslə camaatı) çağırmağa başladı. Qureyşlilər onun yanına toplanıb soruşdular: "Nə olub sənə?" Dedi: "Əgər mən sizə desəm ki, düşmən səhər və ya axşam bizim üstümüzə hücum edəcək, mənə inanarsınızmı?" Onlar: "Əlbəttə, (inanarıq)"– dedilər. Peyğəmbər ﷺ dedi: "(Onda bilin ki,) mən sizi şiddətli əzabla qorxudan bir peyğəmbərəm!" Əbu Ləhəb[3] dedi: "Ölüm olsun sənə! Bizi bura buna görə yığmısan?" Allah da bu (surəni) nazil etdi: **"Əbu Ləhəbin əlləri qurusun, qurudu da!..."**[4] (əl-Buxari, 4801)

---

[1] "əl-Əhzab" surəsi, 69.

[2] "Səba" surəsi, 46.

[3] Əbu Ləhəb Abdul-Üzzə ibn Abdul-Muttəlib Peyğəmbərin ﷺ əmisi və ən qatı düşmənlərindən biri olmuşdur.

[4] "əl-Məsəd" surəsi.

# سُورَةُ الزُّمَرِ

# əz-Zumər surəsi

## ٥٥– باب: قَوْلُهُ تَعَالَى: ﴿يَٰعِبَادِيَ ٱلَّذِينَ أَسْرَفُواْ عَلَىٰٓ أَنفُسِهِمْ﴾

## 55-ci fəsil. Uca Allahın: "*Qullarıma mənim bu sözümü* de: –Ey Mənim özlərinə qarşı həddi aşmış qullarım..."[1] sözü

١٧٦٢ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ نَاسًا مِنْ أَهْلِ الشِّرْكِ كَانُوا قَدْ قَتَلُوا وَأَكْثَرُوا وَزَنَوْا وَأَكْثَرُوا فَأَتَوْا مُحَمَّدًا ﷺ فَقَالُوا إِنَّ الَّذِي تَقُولُ وَتَدْعُو إِلَيْهِ لَحَسَنٌ لَوْ تُخْبِرُنَا أَنَّ لِمَا عَمِلْنَا كَفَّارَةً فَنَزَلَ: ﴿وَٱلَّذِينَ لَا يَدْعُونَ مَعَ ٱللَّهِ إِلَٰهًا ءَاخَرَ وَلَا يَقْتُلُونَ ٱلنَّفْسَ ٱلَّتِي حَرَّمَ ٱللَّهُ إِلَّا بِٱلْحَقِّ وَلَا يَزْنُونَ﴾ وَنَزَلَتْ: ﴿يَٰعِبَادِيَ ٱلَّذِينَ أَسْرَفُواْ عَلَىٰٓ أَنفُسِهِمْ لَا تَقْنَطُواْ مِن رَّحْمَةِ ٱللَّهِ﴾. [رواه البخاري: ٤٨١٠]

**1762.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Müşriklərdən olan bir zümrə çox adam öldürmüş və dəfələrlə zina etmişdi. Sonra Muhəmmədin ﷺ yanına gəlib dedilər: "Sənin danışdıqların və dəvət etdiyin yol gözəldir... Bir de görək, bizim etdiyimiz (bu günahların) kəffarəsi[2] varmı?" Onda bu ayə nazil oldu: **"Onlar Allahla yanaşı başqa tanrıya yalvarmaz, Allahın haram etdiyi cana haqsız yerə qıymaz və zina etməzlər. Bunu edən kimsə cəzalandırılar."**[3] (Sonra da) bu ayə nazil oldu: **"*Qullarıma mənim bu sözümü* de: "Ey Mənim özlərinə qarşı həddi aşmış qullarım! Allahın rəhmindən ümidinizi üzməyin."**[4] (əl-Buxari, 4810)

## ٥٦– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَمَا قَدَرُواْ ٱللَّهَ حَقَّ قَدْرِهِۦ﴾

## 56-cı fəsil. Uca Allahın: "Onlar Allahı layiqincə qiymətləndirmədilər"[5]– sözü

١٧٦٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ رضي الله عنه قَالَ: جَاءَ حَبْرٌ مِنْ الْأَحْبَارِ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ يَا مُحَمَّدُ إِنَّا نَجِدُ أَنَّ اللَّهَ يَجْعَلُ السَّمَوَاتِ عَلَى إِصْبَعٍ وَالْأَرَضِينَ عَلَى إِصْبَعٍ وَالشَّجَرَ عَلَى إِصْبَعٍ وَالْمَاءَ وَالثَّرَى عَلَى إِصْبَعٍ وَسَائِرَ الْخَلَائِقِ عَلَى إِصْبَعٍ فَيَقُولُ أَنَا الْمَلِكُ فَضَحِكَ النَّبِيُّ ﷺ حَتَّى بَدَتْ نَوَاجِذُهُ تَصْدِيقًا لِقَوْلِ الْحَبْرِ ثُمَّ قَرَأَ رَسُولُ اللَّهِ ﷺ: ﴿وَمَا قَدَرُواْ ٱللَّهَ حَقَّ قَدْرِهِۦ وَٱلْأَرْضُ جَمِيعًا قَبْضَتُهُۥ يَوْمَ ٱلْقِيَٰمَةِ وَٱلسَّمَٰوَٰتُ مَطْوِيَّٰتٌۢ بِيَمِينِهِۦ سُبْحَٰنَهُۥ وَتَعَٰلَىٰ عَمَّا يُشْرِكُونَ﴾. [رواه البخاري: ٤٨١١]

---

[1] "əz-Zumər" surəsi, 53. Ayənin tamamı: "**Allahın rəhmindən ümidinizi üzməyin. Şübhəsiz ki, Allah bütün günahları bağışlayır. O, həqiqətən, Bağışlayandır, Rəhmlidir!**"
[2] Günahların bağışlanılması üçün şəriətin buyurduğu qaydada verilən əvəz.
[3] "əl-Furqan" surəsi, 68.
[4] "əz-Zumər" surəsi, 53.
[5] "əz-Zumər" surəsi, 67.

**1763.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "(Bir dəfə Kitab əhlinin) baş keşişlərindən biri Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ey Muhəmməd! Bizim bildiyimizə görə, Allah göyləri bir Barmağına, yerləri o biri Barmağına, ağacları digər bir Barmağına, suyu və torpağı bir başqa Barmağına, yerdə qalan məxluqatı da (yenə) başqa bir Barmağına yerləşdirmiş və: "Hökmdar Mənəm!"– deyə buyurmuşdur." (Bunu eşidəndə) Peyğəmbər ﷺ (bu alimin) sözünü təsdiqləmək məqsədilə dişləri görünənədək güldü. Sonra da bu ayəni oxudu: **"Onlar Allahı layiqincə qiymətləndirmədilər. Halbuki Qiyamət günü yer bütünlüklə Onun Ovcunda olacaq, göylər isə Onun sağ Əli ilə büküləcəkdir. O, pakdır, müqəddəsdir və onların *Ona* qoşduqları şəriklərdən ucadır."**[1] (əl-Buxari, 4811)

## ٥٧– باب: قَوْلُهُ تَعَالَى:

﴿وَٱلْأَرْضُ جَمِيعًا قَبْضَتُهُۥ يَوْمَ ٱلْقِيَٰمَةِ وَٱلسَّمَٰوَٰتُ مَطْوِيَّٰتٌۢ بِيَمِينِهِۦ﴾

## 57-ci fəsil. Uca Allahın: "...yer bütünlüklə Onun Ovcunda olacaq, göylər isə Onun Əli ilə büküləcəkdir..."[2]– sözü

١٧٦٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: يَقْبِضُ اللَّهُ الأَرْضَ وَيَطْوِي السَّمَوَاتِ بِيَمِينِهِ ثُمَّ يَقُولُ: أَنَا الْمَلِكُ أَيْنَ مُلُوكُ الأَرْضِ. [رواه البخاري: ٤٨١٢]

**1764.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Allah yeri (bütünlüklə) Ovcuna alacaq, göyləri də sağ Əli ilə bükəcək, sonra da belə buyuracaq: "Mənəm Hökmdar! Hanı yer üzünün hökmdarları?!" (əl-Buxari, 4812)

## ٥٨– باب: قَوْلُهُ تَعَالَى:

﴿وَنُفِخَ فِي ٱلصُّورِ فَصَعِقَ مَن فِي ٱلسَّمَٰوَٰتِ وَمَن فِي ٱلْأَرْضِ إِلَّا مَن شَآءَ ٱللَّهُ﴾

## 58-ci fəsil. Uca Allahın: "Sur üfürüləcək və Allahın istədiyi kimsələrdən başqa göylərdə və yerdə kim varsa, hamısı öləcəkdir..."[3] sözü

١٧٦٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: بَيْنَ النَّفْخَتَيْنِ أَرْبَعُونَ. قَالُوا: يَا أَبَا هُرَيْرَةَ أَرْبَعُونَ يَوْمًا؟ قَالَ أَبَيْتُ قَالَ أَرْبَعُونَ سَنَةً؟ قَالَ أَبَيْتُ قَالَ أَرْبَعُونَ شَهْرًا؟ قَالَ أَبَيْتُ وَيَبْلَى كُلُّ شَيْءٍ مِنْ الإِنْسَانِ إِلَّ عَجْبَ ذَنَبِهِ فِيهِ يُرَكَّبُ الْخَلْقُ. [رواه البخاري: ٤٨١٤]

---

[1] "əz-Zumər" surəsi, 67.

[2] "əz-Zumər" surəsi, 67.

[3] "əz-Zumər" surəsi, 68. Ayənin tamamı: **"...Sonra bir daha ona üfürülən kimi onlar qalxıb baxacaqlar."**

**1765.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Surun birinci üfürülməsindən ikinci üfürülməsinədək qırx keçəcək." Bəziləri (Əbu Hureyradan ﷺ): "Qırx gün?"– deyə soruşdular. O cavab vermədi. "Qırx il?"– deyə soruşdular. Yenə cavab vermədi. "Qırx ay?"– deyə soruşdular. Yenə cavab vermədi. Sonra o dedi: "İnsan (öldükdən sonra) onun bütün cəsədi çürüyür. Yalnız büzdüm[1] sümüyündən başqa. Qiyamət günü yaradılış məhz ondan başlayacaqdır" (əl-Buxari, 4814)

## سُورَةُ الشُّورَى



## əş-Şura surəsi

٥٩– باب:

قَوْلُهُ تَعَالَى: ﴿إِلَّا ٱلْمَوَدَّةَ فِي ٱلْقُرْبَىٰ﴾

### 59-cu fəsil. Uca Allahın: "...qohumluq sevgisindən başqa bir şey istəmirəm..."[2]– sözü

١٧٦٦ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: إِنَّ النَّبِيَّ ﷺ لَمْ يَكُنْ بَطْنٌ مِنْ قُرَيْشٍ إِلاَّ كَانَ لَهُ فِيهِمْ قَرَابَةٌ فَقَالَ إِلاَّ أَنْ تَصِلُوا مَا بَيْنِي وَبَيْنَكُمْ مِنْ الْقَرَابَةِ. [رواه البخاري: ٤٨١٨]

**1766.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Qureyş tayfalarının hər biri ilə Peyğəmbərin ﷺ qohumluq əlaqəsi var idi. O, deyərdi: "(Mən sizdən bunun əvəzində qohumluq sevgisindən başqa bir şey istəmirəm.) Yalnız mənimlə sizin aranızda olan qohumluq əlaqələrini möhkəmləndirməkdən başqa." (əl-Buxari, 4818)

## سُورَةُ الدُّخَانِ



## əd-Duxan surəsi

٦٠– باب:

قَوْلُهُ تَعَالَى: ﴿رَبَّنَا ٱكْشِفْ عَنَّا ٱلْعَذَابَ إِنَّا مُؤْمِنُونَ﴾

### 60-cı fəsil. Uca Allahın: "Ey Rəbbimiz! Bizi bu əzabdan qurtar, biz artıq inanırıq!"[3]– sözü

١٧٦٧ – عَنْ مَسْرُوقٍ قَالَ: دَخَلْتُ عَلَى عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ فَقَالَ: إِنَّ مِنْ الْعِلْمِ أَنْ يَقُولَ لِمَا لاَ يَعْلَمُ لاَ أَعْلَمُ فَإِنَّ اللَّهَ قَالَ لِنَبِيِّهِ ﷺ: ﴿قُلْ مَآ أَسْـَٔلُكُمْ عَلَيْهِ مِنْ أَجْرٍ وَمَآ أَنَا۠ مِنَ ٱلْمُتَكَلِّفِينَ﴾ إِنَّ قُرَيْشًا لَمَّا غَلَبُوا النَّبِيَّ ﷺ وَاسْتَعْصَوْا عَلَيْهِ قَالَ:

---

[1] Onurğanın qurtaracağını təşkil edən sümük.
[2] "əş-Şura" surəsi, 23.
[3] "əd-Duxan" surəsi, 12.

اللَّهُمَّ أَعِنِّي عَلَيْهِمْ بِسَبْعٍ كَسَبْعِ يُوسُفَ فَأَخَذَتْهُمْ سَنَةٌ أَكَلُوا فِيهَا الْعِظَامَ وَالْمَيْتَةَ مِنَ الْجَهْدِ حَتَّى جَعَلَ أَحَدُهُمْ يَرَى مَا بَيْنَهُ وَبَيْنَ السَّمَاءِ كَهَيْئَةِ الدُّخَانِ مِنَ الْجُوعِ قَالُوا: ﴿رَبَّنَا ٱكْشِفْ عَنَّا ٱلْعَذَابَ إِنَّا مُؤْمِنُونَ﴾ فَقِيلَ لَهُ إِنْ كَشَفْنَا عَنْهُمْ عَادُوا فَدَعَا رَبَّهُ فَكَشَفَ عَنْهُمْ فَعَادُوا فَانْتَقَمَ اللَّهُ مِنْهُمْ يَوْمَ بَدْرٍ فَذَلِكَ قَوْلُهُ تَعَالَى: ﴿فَٱرْتَقِبْ يَوْمَ تَأْتِي ٱلسَّمَآءُ بِدُخَانٍ مُّبِينٍ﴾ إِلَى قَوْلِهِ جَلَّ ذِكْرُهُ ﴿إِنَّا مُنتَقِمُونَ﴾. [رواه البخاري: ٤٨٢٢]

**1767.** Rəvayət edilir ki, Məsruq[1] demişdir: "(Bir dəfə) Abdullah ibn Məsudun ﷺ yanına gəldim. O dedi: "İnsanın bilmədiyi bir şeyə "bilmirəm" deməyi özü elmli olmaq deməkdir. Çünki Allah Öz peyğəmbərinə ﷺ belə buyurur: **"De: "Mən buna görə sizdən heç bir mükafat istəmirəm və mən özümdən bir şey uydurmağa çalışmıram"[2].** Qureyşlilər Peyğəmbəri ﷺ üstələdiyi və ona qarşı çıxdığı zaman Peyğəmbər ﷺ (bəddua edib) demişdi: "Allahım, onlara qarşı mənə kömək et və onlara, Yusufun zamanında göndərdiyin yeddi (qıtlıq və quraqlıq) illəri kimi illər göndər!" Sonra onlara elə bir quraqlıq üz verdi ki, onlar məhv olmağa, sümük və ölmüş heyvan yeməyə başladılar. Hətta, olurdu ki, adam acından yerlə göy arasında tüstüyə bənzər şeylər görürdü. Belə olduqda onlar dedilər: **"Ey Rəbbimiz! Bizi bu əzabdan qurtar, biz artıq inanırıq!"** Onda Peyğəmbərə ﷺ buyuruldu: "Əgər Biz onları əzabdan qurtarsaq, onlar (yenə küfrə) qayıdacaqlar." Peyğəmbər ﷺ Rəbbinə dua etdi və Allah onları əzabdan qurtardı. Sonra onlar (yenə küfrə) qayıtdılar, Allah da Bədr günü onlardan intiqam aldı. Uca Allah bu xüsusda buyurur: **"Sən göydən aşkar bir tüstü gələcəyi günü gözlə. O *tüstü ki,* insanları bürüyəcəkdir. Bu, ağrılı-acılı bir əzabdır. *Onlar:* "Ey Rəbbimiz! Bizi bu əzabdan qurtar, biz də iman gətirək"– deyəcəklər. Onlar necə öyüd-nəsihət eşidə bilərlər ki, artıq onlara açıq-aşkar bir peyğəmbər gəlsə də, onlar ondan üz çevirib: "Öyrədilmiş bir dəlidir!"– dedilər. Biz əzabı bir az sizdən uzaqlaşdırarıq, amma siz yenə *azğınlığa* qayıdacaqsınız. *Kafirləri* böyük bir müsibətlə yaxalayacağımız gün, Biz *onlardan* intiqam alacağıq"[3].** (əl-Buxari, 4822)

## سُورَةُ الجَاسِيَةِ

## əl-Casiyə surəsi

### ٦١– باب:

### قَوْلُهُ تَعَالَى: ﴿وَمَا يُهْلِكُنَآ إِلَّا ٱلدَّهْرُ﴾

### 61-ci fəsil. Uca Allahın: "Onlar dedilər: "*Həyat* ancaq bizim dünya həyatımızdır. *Kimimiz* ölür, *kimimiz də* doğulur. Bizi öldürən ancaq zamandır"[4]– sözü

١٧٦٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: قَالَ اللَّهُ عَزَّ وَجَلَّ: يُؤْذِينِي ابْنُ آدَمَ يَسُبُّ الدَّهْرَ وَأَنَا الدَّهْرُ بِيَدِي الأَمْرُ أُقَلِّبُ اللَّيْلَ وَالنَّهَارَ. [رواه البخاري: ٤٨٢٦]

---

[1] 1752-ci hədisə bax.
[2] "Sad" surəsi, 86.
[3] "əd-Duxan" surəsi, 10-16.
[4] "əl-Casiyə" surəsi, 24.

**1768.** Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir[1]: "Qüdrətli və əzəmətli Allah buyurur: "Adəm övladı dəhri söyməklə Mənə əziyyət verir. (Çünki) dəhr[2] Mənəm! Hər şey Mənim Əlimdədir, gecəni gündüzə, gündüzü də gecəyə çevirən Mənəm!"[3] (əl-Buxari, 4826)

# سُورَةُ الأَحْقَافِ

# əl-Əhqaf surəsi

## ٦٢ – باب: قَوْلُهُ تَعَالَى: ﴿فَلَمَّا رَأَوْهُ عَارِضًا مُّسْتَقْبِلَ أَوْدِيَتِهِمْ﴾

## 62-ci fəsil.
## Uca Allahın: "Nəhayət, o *əzabı* vadilərinə doğru gələn bir bulud şəklində gördükdə..."[4]– sözü

١٧٦٩ – عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا زَوْجِ النَّبِيِّ ﷺ قَالَتْ: مَا رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ ضَاحِكًا حَتَّى أَرَى مِنْهُ لَهَوَاتِهِ إِنَّمَا كَانَ يَتَبَسَّمُ قَالَتْ وَكَانَ إِذَا رَأَى غَيْمًا أَوْ رِيحًا عُرِفَ فِي وَجْهِهِ قَالَتْ يَا رَسُولَ اللَّهِ إِنَّ النَّاسَ إِذَا رَأَوْا الْغَيْمَ فَرِحُوا رَجَاءَ أَنْ يَكُونَ فِيهِ الْمَطَرُ وَأَرَاكَ إِذَا رَأَيْتَهُ عُرِفَ فِي وَجْهِكَ الْكَرَاهِيَةُ فَقَالَ يَا عَائِشَةُ مَا يُؤْمِنِّي أَنْ يَكُونَ فِيهِ عَذَابٌ عُذِّبَ قَوْمٌ بِالرِّيحِ وَقَدْ رَأَى قَوْمٌ الْعَذَابَ فَقَالُوا: ﴿قَالُواْ هَٰذَا عَارِضٌ مُّمْطِرُنَا﴾. [رواه البخاري: ٤٨٢٨]

**1769.** Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Aişə ﷺ demişdir: "Mən heç vaxt Peyğəmbərin ﷺ damağı görününcəyədək güldüyünü görməmişdim. O sadəcə gülümsəyərdi. (Peyğəmbərin ﷺ həmişə) bulud və külək gördükdə onun üzünün cizgiləri dəyişərdi. Mən soruşdum: "Ya Rəsulullah, insanlar bulud gördükdə sevinir, yağış yağacağına ümid edirlər. Amma görürəm ki, sən onu gördükdə üzündən narazılıq hiss olunur." Peyğəmbər ﷺ dedi: "Ey Aişə! Mən necə əmin ola bilərəm ki, o özü ilə əzab gətirmir? Axı, küləklə əzaba məruz qalan tayfa olub keçmişdir. Həmçinin (buluddan) əzab görən tayfa da olmuşdur. Halbuki onlar: **"Bu bizə yağış yağdıracaq buluddur!"** demişdilər." (əl-Buxari, 4828)

---

[1] Təbərinin təfsirində hədisin əvvəli səhih isnadla belə rəvayət edilmişdir: "Cahiliyyət dövründə insanlar: "Bizi, gecə və gündüz həlak edir! Bizi həlak edən də, öldürən də, dirildən də odur!"– deyərdilər." Allah da Öz kitabında belə buyurdu: "Onlar dedilər: ***"Həyat* ancaq bizim dünya həyatımızdır. *Kimimiz* ölür, *kimimiz də* doğulur. Bizi öldürən ancaq zamandır."** Bu haqda onların heç bir biliyi yoxdur. Onlar ancaq zənnə qapılırlar"– onlar dəhri (yəni zamanı) söyürlər......"

[2] İbn Teymiyyə demişdir: "Dəhr zamandır. Hər kəs zamanı söyərkən, müsibəti onun başına gətirəni qəsd edir və beləliklə, bu söyüşü Allaha aid edir. Çünki həqiqətdə bu müsibəti onun başına gətirən Allahdır. Deməli: "Dəhr Allahdır"– dedikdə, dəhrə aid etdiyi hər bir şeyin Allaha aidliyi qəsd edilir." Sarimul Məslul, 3/922.

[3] "əd-Duxan" surəsi, 10-16.

[4] "əl-Əhqaf" surəsi, 24. Ayənin tamamı: **"...Bu bizə yağış yağdıracaq buluddur!"– dedilər. *Hud dedi:* "Xeyr! Bu sizin tez gəlməsini istədiyiniz – özü ilə ağrılı-acılı əzab gətirən bir küləkdir!"**

# سُورَةُ مُحَمَّدٍ

## Muhəmməd surəsi

### ٦٣- باب: قَوْلُهُ تَعَالَى: ﴿وَتُقَطِّعُوٓاْ أَرۡحَامَكُمۡ﴾

### 63-cü fəsil.
### Uca Allahın: "qohumluq əlaqələrini kəsəsiniz"[1]– sözü

١٧٧٠ - عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: خَلَقَ اللَّهُ الْخَلْقَ فَلَمَّا فَرَغَ مِنْهُ قَامَتِ الرَّحِمُ فَأَخَذَتْ بِحَقْوِ الرَّحْمَنِ فَقَالَ لَهُ: مَهْ قَالَتْ: هَذَا مَقَامُ الْعَائِذِ بِكَ مِنَ الْقَطِيعَةِ قَالَ أَلاَ تَرْضَيْنَ أَنْ أَصِلَ مَنْ وَصَلَكِ وَأَقْطَعَ مَنْ قَطَعَكِ قَالَتْ: بَلَى يَا رَبِّ قَالَ فَذَاكِ، قَالَ: أَبُو هُرَيْرَةَ اقْرَءُوا إِنْ شِئْتُمْ: ﴿فَهَلۡ عَسَيۡتُمۡ إِن تَوَلَّيۡتُمۡ أَن تُفۡسِدُواْ فِي ٱلۡأَرۡضِ وَتُقَطِّعُوٓاْ أَرۡحَامَكُمۡ﴾. [رواه البخاري: ٤٨٣٠]

**1770.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah məxluqatı yaratdı, yaradılışı başa çatdırdıqdan sonra qohumluq əlaqəsi ayağa qalxıb ər-Rəhmanın ətəyindən yapışdı. Allah ondan: "Nə olub?"– deyə soruşdu. O dedi: "Bu, qohumluq əlaqələrini kəsməkdən Sənə sığınanın məqamıdır." Allah buyurdu: "Səni birləşdirəni birləşdirməyimə, kəsəni də kəsməyimə razı deyilsənmi?!" O dedi: "Əlbəttə (razıyam), ya Rəbb!" Allah buyurdu: "Elə belə də olacaq!"

Sonra Əbu Hureyra ﷺ dedi: "İstəyirsinizsə, (bu ayəni) oxuyun: **"Əgər *haqdan* üz çevirsəniz, ola bilsin ki, yer üzündə fitnə-fəsad törədəsiniz və qohumluq əlaqələrini kəsəsiniz."** (əl-Buxari, 4830)

١٧٧١ - عَنْهُ ﷺ فِي رِوَايَةٍ قَالَ: قَالَ رَسُولُ اللهِ ﷺ: اقْرَءُوا إِنْ شِئْتُمْ: ﴿فَهَلۡ عَسَيۡتُمۡ﴾. [رواه البخاري: ٤٨٣١]

**1771.** Digər rəvayətdə Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbər ﷺ buyurdu: "İstəyirsinizsə, (bu ayəni) oxuyun: **"Əgər *haqdan* üz çevirsəniz..."** (əl-Buxari, 4831)

# سُورَةُ ق

## Qaf surəsi

### ٦٤- باب: قَوْلُهُ تَعَالَى: ﴿وَتَقُولُ هَلۡ مِن مَّزِيدٖ﴾

### 64-cü fəsil.
### Uca Allahın: "O gün Biz Cəhənnəmə: "Doldunmu?"– deyəcəyik. O isə: "Yenə varmı?"– deyəcəkdir"[2]– sözü

١٧٧٢ - عَنْ أَنَسٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ يُلْقَى فِي النَّارِ: ﴿وَتَقُولُ هَلۡ مِن مَّزِيدٖ﴾ حَتَّى يَضَعَ قَدَمَهُ فَتَقُولُ: قَطْ قَطْ. [رواه البخاري: ٤٨٤٨]

[1] "Muhəmməd" surəsi, 22. Ayənin əvvəli: **"Əgər *haqdan* üz çevirsəniz, ola bilsin ki, yer üzündə fitnə-fəsad törədəsiniz və..."**

[2] "Qaf" surəsi, 30.

**1772.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Günahkarlar) oda atılacağı zaman (od): **"Yenə varmı?"- deyəcək.** Nəhayət, Allah Ayağını onun üstünə qoyacaq və o: "Yetər, yetər!"– deyəcək" (əl-Buxari, 4848)

١٧٧٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ تَحَاجَّتْ الْجَنَّةُ وَالنَّارُ فَقَالَتْ النَّارُ أُوثِرْتُ بِالْمُتَكَبِّرِينَ وَالْمُتَجَبِّرِينَ وَقَالَتْ الْجَنَّةُ مَا لِي لاَ يَدْخُلُنِي إِلاَّ ضُعَفَاءُ النَّاسِ وَسَقَطُهُمْ قَالَ اللَّهُ تَبَارَكَ وَتَعَالَى لِلْجَنَّةِ: أَنْتِ رَحْمَتِي أَرْحَمُ بِكِ مَنْ أَشَاءُ مِنْ عِبَادِي وَقَالَ لِلنَّارِ: إِنَّمَا أَنْتِ عَذَابِي أُعَذِّبُ بِكِ مَنْ أَشَاءُ مِنْ عِبَادِي وَلِكُلِّ وَاحِدَةٍ مِنْهُمَا مِلْؤُهَا فَأَمَّا النَّارُ فَلاَ تَمْتَلِئُ حَتَّى يَضَعَ رِجْلَهُ فَتَقُولُ: قَطْ قَطْ فَهُنَالِكَ تَمْتَلِئُ وَيُزْوَى بَعْضُهَا إِلَى بَعْضٍ وَلاَ يَظْلِمُ اللَّهُ عَزَّ وَجَلَّ مِنْ خَلْقِهِ أَحَدًا وَأَمَّا الْجَنَّةُ فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ يُنْشِئُ لَهَا خَلْقًا. [رواه البخاري: ٤٨٥٠]

**1773.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bir dəfə) Cənnətlə Cəhənnəm höcətləşdi. Cəhənnəm dedi: "Mən (məxsusi olaraq) inadkarlardan və təkəbbürlülərdən ötrü yaradılmışam." Cənnət dedi: "Mənə nə olub ki, içimə ancaq zəif və aciz (görünən) adamlar girsin?" Onda ulu və uca Allah Cənnətə buyurdu: "Sən Mənim rəhmətimsən, Mən sənin vasitənlə qullarımdan dilədiyim kimsəyə rəhm edərəm." Sonra Cəhənnəmə buyurdu: "Sən də Mənim əzabımsan, Mən sənin vasitənlə qullarımdan dilədiyim kimsəyə əzab verərəm." Onların hər biri (kifayət qədər insan və cinlə) doldurulacaq. Cəhənnəm ancaq o zaman dolacaq ki, Allah Öz Ayağını onun üstünə qoyacaq və o: "Yetər, yetər!"– deyəcək. Onda o, artıq dolacaq və (içindəkiləri) qaplayacaq. Qüdrətli və əzəmətli Allah qullarında heç kəsə zülm etməz. Cənnətə gəlincə, qüdrətli və əzəmətli Allah onun (dolması) üçün başqa varlıqlar yaradacaq." (əl-Buxari, 4850)

# سُورَةُ الطُّورِ

# ət-Tur surəsi

## ٦٥– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَالطُّورِ ۝١ وَكِتَابٍ مَّسْطُورٍ ۝٢﴾

## 65-ci fəsil. Uca Allahın: "And olsun dağa! And olsun yazılmış Kitaba!"[1] sözü

١٧٧٤ – عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقْرَأُ فِي الْمَغْرِبِ بِالطُّورِ فَلَمَّا بَلَغَ هَذِهِ الآيَةَ: ﴿أَمْ خُلِقُوا مِنْ غَيْرِ شَيْءٍ أَمْ هُمُ الْخَالِقُونَ أَمْ خَلَقُوا السَّمَاوَاتِ وَالْأَرْضَ بَل لَّا يُوقِنُونَ أَمْ عِندَهُمْ خَزَائِنُ رَبِّكَ أَمْ هُمُ الْمُصَيْطِرُونَ﴾ قَالَ كَادَ قَلْبِي أَنْ يَطِيرَ. [رواه البخاري: ٤٨٥٤]

**1774.** Rəvayət edilir ki, Cubeyr ibn Mutim ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ məğrib namazında "ət-Tur" surəsini oxuduğunu eşitdim. O, oxuyub: **"Bəlkə onlar öz-özünə yaranıblar? Yaxud onlar yaradanlardır? Yoxsa onlar göyləri və yeri yaradıblar? Xeyr, onlar qətiyyən inanmırlar. Yoxsa sənin Rəbbinin**

[1] "ət-Tur" surəsi, 1-2.

**xəzinələri onlardadır? Yaxud onlar hökm sahibidirlər?"**[1] ayələrinə çatdıqda qəlbim az qaldı ki, uçsun." (əl-Buxari, 4854)

## سُورَةُ النَّجْمِ

## ən-Nəcm surəsi

### ٦٦– باب: قَوْلُهُ تَعَالَى: ﴿ أَفَرَءَيْتُمُ ٱللَّٰتَ وَٱلْعُزَّىٰ ﴾

### 66-cı fəsil. Uca Allahın: "Siz *tapındığınız* Lat və Uzzanı gördünüzmü?"[2] sözü

**١٧٧٥** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ مَنْ حَلَفَ فَقَالَ فِي حَلِفِهِ وَاللاَّتِ وَالْعُزَّى فَلْيَقُلْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَمَنْ قَالَ لِصَاحِبِهِ تَعَالَ أُقَامِرْكَ فَلْيَتَصَدَّقْ. [رواه البخاري: ٤٨٦٠]

**1775.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər kim and içərkən: "Lata[3] and olsun, Uzzaya[4] and olsun!"– desə, qoy: "Lə ilahə illəllah!"– desin. Həmçinin, kim dostuna: "Gəl qumar oynayaq"– desə, qoy sədəqə versin." (əl-Buxari, 4860)

## سُورَةُ القَمَرِ

## əl-Qəmər surəsi

### ٦٧– باب: قَوْلُهُ تَعَالَى: ﴿ بَلِ ٱلسَّاعَةُ مَوْعِدُهُمْ وَٱلسَّاعَةُ أَدْهَىٰ وَأَمَرُّ ﴾

### 67-ci fəsil. Uca Allahın: "Xeyr! Onlara vəd edilmiş vaxt o Saatdır. O Saat isə daha ağır, daha acıdır"[5] sözü

**١٧٧٦** – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: لَقَدْ أُنْزِلَ عَلَى مُحَمَّدٍ ﷺ بِمَكَّةَ وَإِنِّي لَجَارِيَةٌ أَلْعَبُ: ﴿ بَلِ ٱلسَّاعَةُ مَوْعِدُهُمْ وَٱلسَّاعَةُ أَدْهَىٰ وَأَمَرُّ ﴾. [رواه البخاري: ٤٨٧٦]

**1776.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Məkkədə, mən hələ oyuncaqla oynayan bir uşaq ikən Muhəmmədə ﷺ bu ayə nazil olmuşdur: **"Xeyr! Onlara vəd edilmiş vaxt o Saatdır. O Saat isə daha ağır, daha acıdır."** (əl-Buxari, 4876)

---

[1] "ət-Tur" surəsi, 35-37.

[2] "ən-Nəcm" surəsi, 19.

[3] Taifdə yerləşdirilmiş və Səqif qəbiləsinin ilahiləşdirdiyi ərəb bütpərəstlərinin ən məşhur bütlərindən biri. O, ağ qaya üzərində tikilmiş, örtüklə örtülmüş və ətrafına çəpər çəkilmiş və öz xidmətçiləri olan məbəd idi. əl-Muğira ibn Şöbə və Əbu Süfyan ibn Hərb Muhəmməd Peyğəmbərin ﷺ əmri ilə bu bütü dağıdıb yandırdılar. Sonralar bu yerdə məscid tikdilər.

[4] Bütpərəst ərəblərin ilahiləşdirdikləri və Məkkə ilə Taif arasında Nəhl adlanan yerdə yerləşdirilən ən məşhur bütlərindən biridir.

[5] "əl-Qəmər" surəsi, 46.

# سُورَةُ الرَّحْمَانِ

# ər-Rəhman surəsi

## ٦٨– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَمِن دُونِهِمَا جَنَّتَانِ﴾

## 68-ci fəsil. Uca Allahın: "Bu ikisindən başqa daha iki Cənnət bağı da vardır"[1] sözü

١٧٧٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ قَيْسٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: جَنَّتَانِ مِنْ فِضَّةٍ آنِيَتُهُمَا وَمَا فِيهِمَا وَجَنَّتَانِ مِنْ ذَهَبٍ آنِيَتُهُمَا وَمَا فِيهِمَا وَمَا بَيْنَ الْقَوْمِ وَبَيْنَ أَنْ يَنْظُرُوا إِلَى رَبِّهِمْ إِلاَّ رِدَاءُ الْكِبْرِ عَلَى وَجْهِهِ فِي جَنَّةِ عَدْنٍ. [رواه البخاري: ٤٨٧٨]

**1777.** Abdullah ibn Qeys ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İki cənnət vardır ki, onların içindəki qab-qacaqlar və başqa əşyalar gümüşdəndir. Digər iki cənnət də vardır ki, onların içindəki qab-qacaqlar və başqa əşyalar qızıldandır. Əzəmət pərdəsindən başqa heç bir şey Ədn cənnətində olan kimsələrə Rəbbinin Üzünü görməyə mane olmayacaq." (əl-Buxari, 4878)

## ٦٩– باب: قَوْلُهُ تَعَالَى: ﴿حُورٌ مَّقْصُورَاتٌ فِي الْخِيَامِ﴾

## 69-cu fəsil. Uca Allahın: "Çadırlarda gözlərini *öz ərlərinə* dikmiş hurilər vardır"[2] sözü

١٧٧٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ قَيْسٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: إِنَّ فِي الْجَنَّةِ خَيْمَةً مِنْ لُؤْلُؤَةٍ مُجَوَّفَةٍ عَرْضُهَا سِتُّونَ مِيلاً فِي كُلِّ زَاوِيَةٍ مِنْهَا أَهْلٌ مَا يَرَوْنَ الآخَرِينَ يَطُوفُ عَلَيْهِمُ الْمُؤْمِنُونَ وَجَنَّتَانِ مِنْ فِضَّةٍ آنِيَتُهُمَا وَمَا فِيهِمَا وَجَنَّتَانِ مِنْ كَذَا آنِيَتُهُمَا وَمَا فِيهِمَا وَمَا بَيْنَ الْقَوْمِ وَبَيْنَ أَنْ يَنْظُرُوا إِلَى رَبِّهِمْ إِلاَّ رِدَاءُ الْكِبْرِ عَلَى وَجْهِهِ فِي جَنَّةِ عَدْنٍ. [رواه البخاري: ٤٨٧٨]

**1778.** Abdullah ibn Qeys ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətdə eni altmış milə bərabər, içi boş mirvarilərdən hazırlanmış çadırlar vardır. Onun hər küncündə bir-birilərini görməyən zövcələr vardır ki, möminlər vaxtaşırı onların yanına girəcəklər. İki cənnət vardır ki, onların içindəki qab-qacaqlar və başqa əşyalar gümüşdəndir. Digər iki cənnət də vardır ki, onların içindəki qab-qacaqlar və başqa əşyalar qızıldandır. Əzəmət pərdəsindən başqa heç bir şey Ədn cənnətində olan kimsələrə Rəbbinin Üzünü görməyə maneə olmayacaq." (əl-Buxari, 4879)

[1] "ər-Rəhman" surəsi, 62.
[2] "ər-Rəhman" surəsi, 72.

# سُورَةُ الْمُمْتَحَنَةِ

# əl-Mumtəhinə surəsi

## ٧٠– باب: قَوْلُهُ تَعَالَى: ﴿لَا تَتَّخِذُوا۟ عَدُوِّى وَعَدُوَّكُمْ أَوْلِيَآءَ﴾

## 70-ci fəsil. Uca Allahın: “Ey iman gətirənlər! Mənim düşmənimi də, öz düşməninizi də özünüzə dost tutmayın!”[1] sözü

**١٧٧٩** – عَنْ عَلِيٍّ ﷺ قَالَ: بَعَثَنِي رَسُولُ اللَّهِ ﷺ أَنَا وَالزُّبَيْرَ وَالْمِقْدَادَ فَقَالَ انْطَلِقُوا حَتَّى تَأْتُوا رَوْضَةَ خَاخٍ فَإِنَّ بِهَا ظَعِينَةً مَعَهَا كِتَابٌ فَخُذُوهُ مِنْهَا فَذَهَبْنَا تَعَادَى بِنَا خَيْلُنَا حَتَّى أَتَيْنَا الرَّوْضَةَ فَإِذَا نَحْنُ بِالظَّعِينَةِ فَقُلْنَا أَخْرِجِي الْكِتَابَ فَقَالَتْ مَا مَعِي مِنْ كِتَابٍ فَقُلْنَا لَتُخْرِجِنَّ الْكِتَابَ أَوْ لَنُلْقِيَنَّ الثِّيَابَ فَأَخْرَجَتْهُ مِنْ عِقَاصِهَا فَأَتَيْنَا بِهِ النَّبِيَّ ﷺ فَإِذَا فِيهِ مِنْ حَاطِبِ بْنِ أَبِي بَلْتَعَةَ إِلَى أُنَاسٍ مِنَ الْمُشْرِكِينَ مِمَّنْ بِمَكَّةَ يُخْبِرُهُمْ بِبَعْضِ أَمْرِ النَّبِيِّ ﷺ فَقَالَ النَّبِيُّ ﷺ مَا هَذَا يَا حَاطِبُ قَالَ لَا تَعْجَلْ عَلَيَّ يَا رَسُولَ اللَّهِ إِنِّي كُنْتُ امْرَأً مِنْ قُرَيْشٍ وَلَمْ أَكُنْ مِنْ أَنْفُسِهِمْ وَكَانَ مَنْ مَعَكَ مِنَ الْمُهَاجِرِينَ لَهُمْ قَرَابَاتٌ يَحْمُونَ بِهَا أَهْلِيهِمْ وَأَمْوَالَهُمْ بِمَكَّةَ فَأَحْبَبْتُ إِذْ فَاتَنِي مِنَ النَّسَبِ فِيهِمْ أَنْ أَصْطَنِعَ إِلَيْهِمْ يَدًا يَحْمُونَ قَرَابَتِي وَمَا فَعَلْتُ ذَلِكَ كُفْرًا وَلَا ارْتِدَادًا عَنْ دِينِي فَقَالَ النَّبِيُّ ﷺ إِنَّهُ قَدْ صَدَقَكُمْ فَقَالَ عُمَرُ دَعْنِي يَا رَسُولَ اللَّهِ فَأَضْرِبَ عُنُقَهُ فَقَالَ إِنَّهُ شَهِدَ بَدْرًا وَمَا يُدْرِيكَ لَعَلَّ اللَّهَ عَزَّ وَجَلَّ اطَّلَعَ عَلَى أَهْلِ بَدْرٍ فَقَالَ اعْمَلُوا مَا شِئْتُمْ فَقَدْ غَفَرْتُ لَكُمْ

قَالَ عَمْرٌو وَنَزَلَتْ فِيهِ: ﴿يَـٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوا۟ لَا تَتَّخِذُوا۟ عَدُوِّى وَعَدُوَّكُمْ أَوْلِيَآءَ﴾. [رواه البخاري: ٤٨٩٠]

**1779.** Rəvayət edilir ki, Əli (ibn Əbu Talib) ﷺ demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ mənə, Zubeyrə və Miqdada dedi: “Rövdətü Xaxa[2] gedin! Orada kəcavənin içində gedən, özü ilə məktub aparan bir qadına rast gələcəksiniz. Məktubu ondan götürərsiniz.” Bundan sonra biz yola düşdük və atlarımızı dörd nala çapdıq. Nəhayət, gəlib Rövdəyə çatdıq və orada kəcavəni gördük. Biz (onun içindəki qadına): “Məktubu çıxart!”– dedik. Qadın: “Məktub nədir?” Biz dedik: “Ya məktubu verəcəksən, ya da səni soyunduracağıq.” Onda qadın saçlarının arasından məktubu çıxartdı və biz onu (Peyğəmbərə ﷺ) gətirdik. Məktubda yazılmışdı: “Hatib ibn Əbu Bəltəədən...” Məktubda (Hatib) Məkkə müşriklərindən olan bir dəstəyə Peyğəmbərin ﷺ işləri barədə xəbər verirdi. Peyğəmbər ﷺ dedi: “Bu nədir, ey Hatib?!” Hatib dedi: “Məni (qınamağa) tələsmə, ya Rəsulullah! Mən qureyşdən idim, lakin onların nəslindən deyildim. Səninlə birlikdə (hicrət etmiş) mühacirlərin qohum-əqrəbası onların Məkkədəki ailələrini və mallarını himayə edir. Onların arasında mənim qohumlarım yoxdur deyə, mən onları qorumaq üçün belə etmək istəyirdim. Mən bunu kafir olmaq və ya dindən dönmək məqsədilə etmədim.” Peyğəmbər ﷺ buyurdu: “Həqiqətən, o, sizə düz deyib.” (Bu vaxt) Ömər dedi: “Ya Rəsulullah, mənə izn ver onun boynunu vurum.” Peyğəmbər ﷺ buyurdu: “Axı, o, Bədr döyüşündə iştirak edib. Məlumun olsun ki, qüdrətli və əzəmətli Allah Bədrdə döyüşənlərə baxıb demişdir: “İstədiyinizi edin, artıq Mən sizi bağışlamışam!”

[1] “əl-Mumtəhinə” surəsi, 1.
[2] Mədinə ilə Məkkə arasında yerləşən bir yer.

Amr demişdir: "(Hatibin) barəsində bu ayə nazil oldu: "Ey iman gətirənlər! Mənim düşmənimi də, öz düşməninizi də özünüzə dost tutmayın!" (əl-Buxari, 4890)

## ٧١- باب: قَوْلُهُ تَعَالَى: ﴿إِذَا جَآءَكَ ٱلْمُؤْمِنَٰتُ يُبَايِعْنَكَ﴾

## 71-ci fəsil. Uca Allahın: "Ey Peyğəmbər! Mömin qadınlar Allaha heç bir şərik qoşmayacaqlarına..."[1] sözü

١٧٨٠ - عَنْ أُمِّ عَطِيَّةَ رضي الله عنها قَالَتْ: بَايَعْنَا رَسُولَ اللَّهِ ﷺ فَقَرَأَ عَلَيْنَا: ﴿أَن لَّا يُشْرِكْنَ بِٱللَّهِ شَيْـًٔا﴾ وَنَهَانَا عَنْ النِّيَاحَةِ فَقَبَضَتْ امْرَأَةٌ يَدَهَا فَقَالَتْ أَسْعَدَتْنِي فُلَانَةُ أُرِيدُ أَنْ أَجْزِيَهَا فَمَا قَالَ لَهَا النَّبِيُّ ﷺ شَيْئًا فَانْطَلَقَتْ وَرَجَعَتْ فَبَايَعَهَا. [رواه البخاري: ٤٨٩٢]

**1780.** Rəvayət edilir ki, Ummu Ətiyyə رضي الله عنها demişdir: "Biz (qadınlar) Peyğəmbərə ﷺ beyət etdikdən sonra o bizə bu ayəni oxudu: **"Mömin qadınlar Allaha heç bir şərik qoşmayacaqlarına..."** və bizə (ölən adam üçün) vay-şivən salıb ağlamağı qadağan etdi. Bu vaxt bir qadın əlini geri çəkdi[2] və dedi: "Filan qadın mənim ölümə ağlayıb, mən də gərək onun ölüsünə ağlayım." Peyğəmbər ﷺ ona heç nə demədi. Qadın çıxıb getdi və (bir müddət keçdikdən sonra beyət etmək üçün) geri qayıtdı. Peyğəmbər ﷺ də onun beyətini qəbul etdi." (əl-Buxari, 4892)

# سُورَةُ الجُمُعَةِ

# əl-Cumuə surəsi

## ٧٢- باب:

## قَوْلُهُ تَعَالَى: ﴿وَءَاخَرِينَ مِنْهُمْ لَمَّا يَلْحَقُوا۟ بِهِمْ﴾

## 72-ci fəsil.

## Uca Allahın: "*Allah səni* hələ *müsəlmanlara* qoşulmamış başqalarına da *elçi göndərmişdir*..."[3] sözü

١٧٨١ - عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: كُنَّا جُلُوسًا عِنْدَ النَّبِيِّ ﷺ فَأُنْزِلَتْ عَلَيْهِ سُورَةُ الْجُمُعَةِ: ﴿وَءَاخَرِينَ مِنْهُمْ لَمَّا يَلْحَقُوا۟ بِهِمْ﴾ قَالَ قُلْتُ: مَنْ هُمْ يَا رَسُولَ اللَّهِ فَلَمْ يُرَاجِعْهُ حَتَّى سَأَلَ ثَلَاثًا وَفِينَا سَلْمَانُ الْفَارِسِيُّ وَضَعَ رَسُولُ اللَّهِ ﷺ يَدَهُ عَلَى سَلْمَانَ ثُمَّ قَالَ لَوْ كَانَ الْإِيمَانُ عِنْدَ الثُّرَيَّا لَنَالَهُ رِجَالٌ أَوْ رَجُلٌ مِنْ هَؤُلَاءِ. [رواه البخاري: ٤٨٩٧]

---

[1] "əl-Mumtəhinə" surəsi, 12. Ayənin davamı: **"...oğurluq və zina etməyəcəklərinə, uşaqlarını öldürməyəcəklərinə, əlləri ilə ayaqları arasında olanı yalanla ört-basdır etməyəcəklərinə (ərlərindən olmayan uşaqlarını onlara isnad etməyəcəklərinə) və heç bir yaxşı işdə sənə qarşı çıxmayacaqlarına dair sənə beyət etmək üçün yanına gəldikləri zaman onların beyətini qəbul et və Allahdan onlar üçün bağışlanma dilə. Həqiqətən, Allah Bağışlayandır, Rəhmlidir."**

[2] Ummu Ətiyyənin bu sözü qadınların da Peyğəmbərə ﷺ əl ilə beyət etməsini göstərir. Halbuki, Aişədən rəvayət edilmiş hədisdə xəbər verilir ki, Peyğəmbərin ﷺ əli naməhrəm qadının əlinə əsla toxunmamışdır. Bu belə izah edilə bilər ki, qadınlar beyət əsnasında sadəcə əlləri ilə işarə edərdilər. "Fəthul-Bari" 13/204.

[3] "əl-Cumuə" surəsi, 3.

**1781.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “(Bir dəfə) biz Peyğəmbərin ﷺ yanında ikən ona “əl-Cumuə” surəsi nazil oldu: ***“Allah səni* həl***ə müsəlmanlara*** **qoşulmamış başqalarına da** ***elçi göndərmişdir...”*** Mən soruşdum: “Kimdir onlar, ya Rəsulullah?” O mənə cavab vermədi. Mən sualımı üç dəfə təkrar etdim. Həmin vaxt Salman Farisi bizim aramızda idi. Peyğəmbər ﷺ əlini Salmanın (ayağının üstünə) qoyub dedi: “Hərgah iman Sürəyya ulduzunun yanında olsaydı, bu adamlar ora da gedib çıxardılar.” (əl-Buxari, 4897)

## سُورَةُ الْمُنَافِقُونَ



## əl-Munafiqun surəsi

### ٧٣- باب: قَوْلُهُ تَعَالَى: ﴿إِذَا جَآءَكَ ٱلْمُنَٰفِقُونَ قَالُوا۟ نَشْهَدُ إِنَّكَ لَرَسُولُ ٱللَّهِ﴾

### 73-cü fəsil. Uca Allahın: “Münafiqlər sənin yanına gəldikləri zaman: “Biz şəhadət veririk ki, sən Allahın Elçisisən!”– deyirlər...”[1] sözü

١٧٨٢ – عَنْ زَيْدِ بْنِ أَرْقَمَ ﷺ قَالَ: كُنْتُ فِي غَزَاةٍ فَسَمِعْتُ عَبْدَ اللَّهِ بْنَ أُبَيٍّ يَقُولُ لاَ تُنْفِقُوا عَلَى مَنْ عِنْدَ رَسُولِ اللَّهِ حَتَّى يَنْفَضُّوا مِنْ حَوْلِهِ وَلَئِنْ رَجَعْنَا مِنْ عِنْدِهِ لَيُخْرِجَنَّ الأَعَزُّ مِنْهَا الأَذَلَّ فَذَكَرْتُ ذَلِكَ لِعَمِّي أَوْ لِعُمَرَ فَذَكَرَهُ لِلنَّبِيِّ ﷺ فَدَعَانِي فَحَدَّثْتُهُ فَأَرْسَلَ رَسُولُ اللَّهِ ﷺ إِلَى عَبْدِ اللَّهِ بْنِ أُبَيٍّ وَأَصْحَابِهِ فَحَلَفُوا مَا قَالُوا فَكَذَّبَنِي رَسُولُ اللَّهِ ﷺ وَصَدَّقَهُ فَأَصَابَنِي هَمٌّ لَمْ يُصِبْنِي مِثْلُهُ قَطُّ فَجَلَسْتُ فِي الْبَيْتِ فَقَالَ لِي عَمِّي مَا أَرَدْتَ إِلَى أَنْ كَذَّبَكَ رَسُولُ اللَّهِ ﷺ وَمَقَتَكَ فَأَنْزَلَ اللَّهُ تَعَالَى: ﴿إِذَا جَآءَكَ ٱلْمُنَٰفِقُونَ﴾ فَبَعَثَ إِلَيَّ النَّبِيُّ ﷺ فَقَرَأَ فَقَالَ إِنَّ اللَّهَ قَدْ صَدَّقَكَ يَا زَيْدُ. [رواه البخاري: ٤٩٠٠]

**1782.** Rəvayət edilir ki, Zeyd ibn Ərqam ﷺ demişdir: “Döyüşlərin birində mən Abdullah ibn Ubeyyin[2] belə dediyini eşitdim: “Allahın elçisinin ətrafındakılara köməklik göstərməyin ki, onlar onun ətrafından dağılıb getsin. Əgər biz onu qoyub Mədinəyə qayıtsaq, izzət və hörmət sahibi olanlar[3] alçaq və zəlil olanları[4] (oradan) çıxardacaqlar!” Mən bu sözləri əmimə, yaxud Ömərə dedim, o da bunu Peyğəmbərə ﷺ çatdırdı. Peyğəmbər ﷺ məni yanına çağırdı və mən eşitdiklərimi ona danışdım. Sonra o, (bu məsələyə aydınlıq gətirmək üçün) Abdullah ibn Ubeyyin və onun tərəfdarlarının yanına adam göndərdi. Onlar isə belə bir söz demədiklərini sübuta yetirmək üçün and içdilər. Peyğəmbər ﷺ mənim dediklərimi yalan saydı və onun andını qəbul etdi. (Onun bu qərarı) məni olduqca kədərləndirdi. Mən hələ heç vaxt belə kədərlənməmişdim. (Bu hadisədən sonra) mən evə qayıtdım və əmim mənə dedi: “Mən istəmirdim

[1] “əl-Munafiqun” surəsi, 1.
[2] Abdullah ibn Ubey ibn Səlul münafiqlərin başçısı olmuşdur.
[3] O, bununla özlərini qəsd edirdi.
[4] Bunu deyəndə o, Peyğəmbəri ﷺ və onun əshabələrini nəzərdə tuturdu.

ki, o, sənin dediklərini təkzib etsin və sənə acığı tutsun!" Onda Uca Allah (bu surəni) nazil etdi: **"Münafiqlər sənin yanına gəldikləri zaman: "Biz şəhadət veririk ki, sən Allahın Elçisisən!"– deyirlər. Allah da bilir ki, sən Onun Elçisisən. Allah şahiddir ki, münafiqlər əsl yalançıdırlar."** Peyğəmbər ﷺ mənim yanıma bir nəfər göndərib bu ayələri mənə oxuduqdan sonra dedi: "Ey Zeyd, Allah sənin dediklərini təsdiq etdi!" (əl-Buxari, 4900)

**١٧٨٣** – وَ عَنْهُ فِي رِوَايَةٍ قَالَ: فَدَعَاهُمْ النَّبِيُّ ﷺ لِيَسْتَغْفِرَ لَهُمْ فَلَوَّوْا رُءُوسَهُمْ. [رواه البخاري: ٤٩٠٣]

**1783.** Digər rəvayətdə Zeyd ibn Ərqam ﷺ demişdir: "Peyğəmbər ﷺ (münafiqləri) yanına çağırdı ki, onlar üçün (Allahdan) bağışlanma diləsin, lakin onlar bundan boyun qaçırdılar." (əl-Buxari, 4903)

**١٧٨٤** – وَ عَنْهُ فِي رِوَايَةٍ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: اللَّهُمَّ اغْفِرْ لِلأَنْصَارِ وَلأَبْنَاءِ الأَنْصَارِ. وَشَكَّ ابْنُ الْفَضْلِ فِي أَبْنَاءِ أَبْنَاءِ الأَنْصَارِ. [رواه البخاري: ٤٩٠٦]

**1784.** Başqa bir rəvayətdə Zeyd ibn Ərqam ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Allahım, ənsarı və onların övladlarını bağışla!"

Ravi ibn Fədl ehtimal edib demişdir: "... və onların övladlarının övladlarını!" (əl-Buxari, 4906)

# سُورَةُ التَّحْرِيمِ

# ət-Təhrim surəsi

## ٧٤– باب: قَوْلُهُ تَعَالَى: ﴿يَـٰٓأَيُّهَا ٱلنَّبِيُّ لِمَ تُحَرِّمُ مَآ أَحَلَّ ٱللَّهُ لَكَ تَبْتَغِى مَرْضَاتَ أَزْوَٰجِكَ﴾

## 74-cü fəsil. Uca Allahın: "Ey Peyğəmbər! Zövcələrini razı salmağa çalışaraq Allahın sənə halal etdiyi şeyi nə üçün özünə qadağan edirsən?"[1] sözü

**١٧٨٥** – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَشْرَبُ عَسَلاً عِنْدَ زَيْنَبَ بِنْتِ جَحْشٍ وَيَمْكُثُ عِنْدَهَا فَوَاطَيْتُ أَنَا وَحَفْصَةُ عَلَى أَيَّتُنَا دَخَلَ عَلَيْهَا فَلْتَقُلْ لَهُ أَكَلْتَ مَغَافِيرَ إِنِّي أَجِدُ مِنْكَ رِيحَ مَغَافِيرَ قَالَ: لاَ وَلَكِنِّي كُنْتُ أَشْرَبُ عَسَلاً عِنْدَ زَيْنَبَ بِنْتِ جَحْشٍ فَلَنْ أَعُودَ لَهُ وَقَدْ حَلَفْتُ لاَ تُخْبِرِي بِذَلِكَ أَحَدًا. [رواه البخاري: ٤٩١٢]

**1785.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ Zeynəb bint Cəhşin evində bal içər və (bu səbəbdən də o,) Zeynəbin yanında çox otururdu. Buna görə də mən Həfsə ilə məsləhətləşdim və biz belə qərara gəldik ki, o hansı birimizin yanına gəlsə ona: "Kitrə[2] yemisən? Səndən onun iyisi gəlir!"– deyək. (Biz Peyğəmbərə ﷺ bunu deyəndə) o belə cavab verdi: "Xeyr, mən sadəcə olaraq Zeynəb bint Cəhşin evində bal içmişəm. And içirəm ki, bir də o

---

[1] "ət-Təhrim" surəsi, 1.

[2] Burada Urfut ağacının gövdəsindən axan yapışqanabənzər yarımşəffaf qatı maye qəsd edilir.

baldan içməyəcəyəm, amma sən bu haqda heç kəsə bir söz demə!"[1] (əl-Buxari, 4912)

## سُورَةُ الْقَلَمِ

## əl-Qələm surəsi

### ٧٥- باب: قَوْلُهُ تَعَالَى: ﴿عُتُلِّۭ بَعْدَ ذَٰلِكَ زَنِيمٍ﴾

### 75-ci fəsil. Uca Allahın: "...daşürəkliyə, bunlardan sonra da *başqasının adını mənimsəyən* fırıldaqçıya"[2] sözü

١٧٨٦ – عَنْ حَارِثَةَ بْنِ وَهْبٍ الْخُزَاعِيِّ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ أَلاَ أُخْبِرُكُمْ بِأَهْلِ الْجَنَّةِ كُلُّ ضَعِيفٍ مُتَضَعِّفٍ لَوْ أَقْسَمَ عَلَى اللَّهِ لأَبَرَّهُ أَلاَ أُخْبِرُكُمْ بِأَهْلِ النَّارِ كُلُّ عُتُلٍّ جَوَّاظٍ مُسْتَكْبِرٍ. [رواه البخاري: ٤٩١٨]

**1786.** Rəvayət edilir ki, Harisə ibn Vəhb əl-Xuzai ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Sizə Cənnət əhli barədə xəbər verimmi?! (Bu,) hər bir fağır, təvazökar (mömindir). Əgər o and içərsə, Allah onun andını mütləq gerçəyə çevirər. Sizə Cəhənnəm sakinləri barədə xəbər verimmi?!" (Bu,) hər bir daşürəkli, tamahkar və yekəxana (adamdır)." (əl-Buxari, 4918)

### ٧٦- باب: قَوْلُهُ تَعَالَى: ﴿يَوْمَ يُكْشَفُ عَن سَاقٍ وَيُدْعَوْنَ إِلَى ٱلسُّجُودِ فَلَا يَسْتَطِيعُونَ﴾

### 76-cı fəsil. Uca Allahın: "Ayağın açılacağı və onlar səcdəyə çağırılacaqları, lakin *buna* qadir ola bilməyəcəkləri gün..."[3] sözü

١٧٨٧ – عَنْ أَبِي سَعِيدٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: يَكْشِفُ رَبُّنَا عَنْ سَاقِهِ فَيَسْجُدُ لَهُ كُلُّ مُؤْمِنٍ وَمُؤْمِنَةٍ فَيَبْقَى كُلُّ مَنْ كَانَ يَسْجُدُ فِي الدُّنْيَا رِيَاءً وَسُمْعَةً فَيَذْهَبُ لِيَسْجُدَ فَيَعُودُ ظَهْرُهُ طَبَقًا وَاحِدًا. [رواه البخاري: ٤٩١٩]

**1787.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "(Qiyamət günü) Rəbbimiz Ayağını açacaq, hər bir mömin kişi və mömin qadın da Ona səcdə edəcəkdir. Qalanları isə dünyada ikən riyakarlıqla, şan-şöhrət üçün səcdə edən münafiqlər olacaqdır. (Həmin gün münafiqlərdən hər biri səcdə) etmək istəyəcək, (lakin bacarmayacaqdır). Onların onurğa sümüyü bir bütöv sümük olacaqdır." (əl-Buxari, 4919)

---

[1] Digər rəvayətdə hədisin tamamında deyilir: "...və bu (ayələr) nazil oldu: **"Ey Peyğəmbər! Zövcələrini razı salmağa çalışaraq Allahın sənə halal etdiyi şeyi nə üçün özünə qadağan edirsən? Allah Bağışlayandır, Rəhmlidir. Allah, andlarınızdan *kəffarə verməklə* azad olmağı sizdən ötrü qanuniləşdirmişdir. Allah sizin himayədarınızdır. O, Biləndir, Müdrikdir. Bir zaman Peyğəmbər öz zövcələrindən birinə sirr verdi. O da bunu *onun digər zövcəsinə* xəbər verdikdə və Allah da bunu *Peyğəmbərə* aşkar etdikdə o, bunun bir qismini *sirr verdiyi* zövcəsinə bildirdi, digər qismindən isə vaz keçdi. *Peyğəmbər* bunu ona bildirdikdə *zövcəsi* dedi: "Bunu sənə kim xəbər verdi?" O dedi: "Bunu mənə *hər şeyi* Bilən, Xəbərdar olan *Allah* xəbər verdi!" Əgər ikiniz də Allaha tövbə etsəniz, *yaxşı olar*. Çünki hər ikinizin qəlbi *günaha* meyl etmişdir. Əgər *Peyğəmbərə* qarşı bir-birinizə dəstək versəniz, *bilin ki,* Allah, Cəbrail və əməlisaleh möminlər onun dostu və yardımçısıdır. Bunlardan başqa mələklər də onun yardımçılarıdır."** Səhih əl-Buxari, 5243

[2] "əl-Qələm" surəsi, 13.

[3] "əl-Qələm" surəsi, 42.

## سُورَةُ النَّازِعَاتِ

## ən-Naziat surəsi

١٧٨٨ – عَنْ سَهْلُ بْنُ سَعْد ﷺ قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ قَالَ بِإِصْبَعَيْهِ هَكَذَا بِالْوُسْطَى وَالَّتِي تَلِي الإِبْهَامَ بُعِثْتُ وَالسَّاعَةُ كَهَاتَيْنِ. [رواه البخاري: ٤٩٣٦]

**1788.** Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərin ﷺ orta barmağıyla işarə barmağını birləşdirib: "Qiyamət Saatı (insanlara,) bu iki barmaq qədər (yaxın olduğu zaman mən peyğəmbər) göndərildim"– dediyinin şahidi oldum." (əl-Buxari, 4936)

## سُورَةُ عَبَسَ

## Əbəsə surəsi

١٧٨٩ – عَنْ عَائِشَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ مَثَلُ الَّذِي يَقْرَأُ الْقُرْآنَ وَهُوَ حَافِظٌ لَهُ مَعَ السَّفَرَةِ الْكِرَامِ الْبَرَرَةِ وَمَثَلُ الَّذِي يَقْرَأُ وَهُوَ يَتَعَاهَدُهُ وَهُوَ عَلَيْهِ شَدِيدٌ فَلَهُ أَجْرَانِ. [رواه البخاري: ٤٩٣٧]

**1789.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Quran oxuyan və onu əzbərdən bilən adam möhtərəm və müti mələklərlə eyni dərəcədədir. Çətinlik çəkə-çəkə daim Quran oxuyan adam isə iki savab qazanır." (əl-Buxari, 4937)

## سُورَةُ الْمُطَفِّفِينَ

## əl-Mutaffifin surəsi

### ٧٧– بَاب:

### قَوْلُهُ تَعَالَى: ﴿يَوْمَ يَقُومُ ٱلنَّاسُ لِرَبِّ ٱلْعَٰلَمِينَ﴾

### 77-ci fəsil.
### Uca Allahın: "O gündə ki, insanlar aləmlərin Rəbbinin qarşısında dayanacaqlar"[1] sözü

١٧٩٠ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ: أَنَّ النَّبِيَّ ﷺ قَالَ: ﴿يَوْمَ يَقُومُ ٱلنَّاسُ لِرَبِّ ٱلْعَٰلَمِينَ﴾ حَتَّى يَغِيبَ أَحَدُهُمْ فِي رَشْحِهِ إِلَى أَنْصَافِ أُذُنَيْهِ. [رواه البخاري: ٤٩٣٨]

**1790.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (Allahın): **"O gündə ki, insanlar aləmlərin Rəbbinin qarşısında dayanacaqlar"** (ayəsini oxuduqdan sonra) dedi: "Onların bəzisi öz tərinin içində qulağının yarısına qədər batacaqdır." (əl-Buxari, 4938)

[1] "əl-Mutaffifin" surəsi, 6.

# سُورَةُ الإِنْشِقَاقِ

# əl-İnşiqaq surəsi

## ٧٨- باب: قَوْلُهُ تَعَالَى: ﴿فَسَوْفَ يُحَاسَبُ حِسَابًا يَسِيرًا﴾

## 78-ci fəsil. Uca Allahın: "...o, yüngül sorğu-sual olunacaq"[1] sözü

١٧٩١ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لَيْسَ أَحَدٌ يُحَاسَبُ إِلاَّ هَلَكَ قَالَتْ قُلْتُ: يَا رَسُولَ اللَّهِ جَعَلَنِي اللَّهُ فِدَاءَكَ أَلَيْسَ يَقُولُ اللَّهُ عَزَّ وَجَلَّ: ﴿فَأَمَّا مَنْ أُوتِيَ كِتَٰبَهُۥ بِيَمِينِهِۦ فَسَوْفَ يُحَاسَبُ حِسَابًا يَسِيرًا﴾ قَالَ ذَاكَ الْعَرْضُ يُعْرَضُونَ وَمَنْ نُوقِشَ الْحِسَابَ هَلَكَ. [رواه البخاري: ٤٩٣٩]

**1791.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim haqq-hesaba çəkilərsə, həlak olar." Mən dedim: "Allah məni sənə fəda etsin, ya Rəsulullah! Məgər qüdrətli və əzəmətli Allah: **"Kimin kitabı sağ əlinə veriləcəksə, o, yüngül sorğu-suala tutulacaq"-** deyə buyurmayır? Peyğəmbər ﷺ dedi: "Bu yalnız ərz edilməyə[2] aiddir. Əməlləri birbəbir hesaba çəkilən kimsə isə həlak olacaqdır." (əl-Buxari, 4939)

## ٧٩- باب: قَوْلُهُ تَعَالَى: ﴿لَتَرْكَبُنَّ طَبَقًا عَن طَبَقٍ﴾

## 79-cu fəsil. Uca Allahın: "Siz mütləq haldan-hala keçib *dəyişəcəksiniz*"[3] sözü

١٧٩٢ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄: ﴿لَتَرْكَبُنَّ طَبَقًا عَن طَبَقٍ﴾ حَالاً بَعْدَ حَالٍ قَالَ هَذَا نَبِيُّكُمْ ﷺ. [رواه البخاري: ٤٩٤٠]

**1792.** Rəvayət edilir ki, (Allahın): **"Siz mütləq təbəqədən-təbəqəyə keçəcəksiniz"** (ayəsi barəsində) ibn Abbas ﵄ demişdir: "Peyğəmbəriniz ﷺ: "Siz haldan-hala keçib dəyişəcəksiniz"– deyə bu ayəni izah etmişdir." (əl-Buxari, 4940)

# سُورَةُ الشَّمْسِ

# əş-Şəms surəsi

## ٨٠- باب

## 80-ci fəsil

١٧٩٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ زَمْعَةَ ﵁: أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَخْطُبُ وَذَكَرَ النَّاقَةَ وَالَّذِي عَقَرَ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ: ﴿إِذِ انۢبَعَثَ أَشْقَىٰهَا﴾ انْبَعَثَ لَهَا رَجُلٌ عَزِيزٌ عَارِمٌ مَنِيعٌ فِي رَهْطِهِ مِثْلُ أَبِي زَمْعَةَ وَذَكَرَ النِّسَاءَ فَقَالَ يَعْمِدُ أَحَدُكُمْ

[1] "əl-İnşiqaq" surəsi, 7-8.
[2] 88-ci hədisin qeydlərinə bax.
[3] "əl-İnşiqaq" surəsi, 19.

فَيَجْلِدُ امْرَأَتَهُ جَلْدَ الْعَبْدِ فَلَعَلَّهُ يُضَاجِعُهَا مِنْ آخِرِ يَوْمِهِ ثُمَّ وَعَظَهُمْ فِي ضَحِكِهِمْ مِنَ الضَّرْطَةِ وَقَالَ لِمَ يَضْحَكُ أَحَدُكُمْ مِمَّا يَفْعَلُ.

وَعَنْهُ فِي رِوَايَةٍ: قَالَ النَّبِيُّ ﷺ: مِثْلُ أَبِي زَمْعَةَ عَمِّ الزُّبَيْرِ بْنِ الْعَوَّامِ. [رواه البخاري: ٤٩٤٢]

**1793.** Rəvayət edilir ki, Abdullah ibn Zəma ﷺ Peyğəmbərin ﷺ xütbə verərkən dişi dəvə[1] və onun diz vətərini kəsən (səmudlu) barəsində (Allahın): **"Onların ən bədbəxti *dəvəni kəsməyə* qalxdı"** (ayəsini oxuyub) belə dediyini eşitmişdir: "Əbu Zəmaya oxşar, çox qüvvətli, (gözləri) qızmış və havadarlarının himayəsində olan birisi qalxıb dişi dəvəni kəsməyə tələsdi."

Sonra Peyğəmbər ﷺ qadınlar haqqında (camaata nəsihət edib) dedi: "Bəziləriniz öz həyat yoldaşlarını kənizi döydüyü kimi döyür, sonra da olur ki, günün axırında onunla bir yatağa girir."

Sonra Peyğəmbər ﷺ birisinin yel buraxmasına gülən əshabələrini tənbeh edib dedi: "Siz nə üçün kiminsə (yel buraxmağına) gülürsünüz?!"

Digər rəvayətdə Peyğəmbər ﷺ demişdir: "Zubeyr ibn Əvvamın əmisi Əbu Zəmaya oxşar..." (əl-Buxari, 4942)

# سُورَةُ العَلَقِ

# əl-Ələq surəsi

## ٨١– باب: قَوْلُهُ تَعَالَى: ﴿ كَلَّا لَئِن لَّمْ يَنتَهِ لَنَسْفَعًا بِالنَّاصِيَةِ نَاصِيَةٍ كَاذِبَةٍ خَاطِئَةٍ ﴾

## 81-ci fəsil. Uca Allahın: "Xeyr! Əgər *yaramaz əməlinə* son qoymasa, *Biz onun* kəkilindən – yalançı, günahkar kəkilindən tutacağıq"[2] sözü

١٧٩٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ أَبُو جَهْلٍ لَئِنْ رَأَيْتُ مُحَمَّدًا يُصَلِّي عِنْدَ الْكَعْبَةِ لَأَطَأَنَّ عَلَى عُنُقِهِ، فَبَلَغَ النَّبِيَّ ﷺ فَقَالَ: لَوْ فَعَلَهُ لَأَخَذَتْهُ الْمَلَائِكَةُ. [رواه البخاري: ٤٩٥٨]

**1794.** Abdullah ibn Abbas رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Əbu Cəhl demişdi: "Əgər mən Muhəmmədin Kəbənin yanında namaz qıldığını görsəm ayağımla onun boynundan yerə basacağam." Bu söz Peyğəmbərə ﷺ xəbər verildikdə o buyurdu: "Belə etsəydi, mələklər onu yaxalayardılar.[3]" (əl-Buxari, 4942)

---

[1] **"Səmud *qövmü* öz azğınlığı üzündən *Allahın elçisini* təkzib etdi. Onların ən bədbəxti *dəvəni kəsməyə* qalxdıqda Allahın elçisi onlara dedi: "Allahın bu dişi dəvəsinə *toxunmayın* və onun su içməsinə *mane olmayın*!" Onlar isə peyğəmbəri yalançı sayıb, dəvənin diz vətərini kəsdilər. Onların Rəbbi də bu günahlarına görə onların hamısını qırıb yerlə-yeksan etdi."** "əş-Şəms" surəsi, 11-14.

[2] "əl-Ələq" surəsi, 15-16.

[3] Əbu Hureyranın ﷺ rəvayət etdiyi hədisdə deyilir ki, (bir dəfə) Əbu Cəhl ərəblərə dedi: "Muhəmməd hələ də sizin yanınızda üzünü torpağa sürtürmü?" Onlar: "Bəli"– deyə cavab verdikdə o dedi: "Lat və Uzzaya and olsun ki, əgər mən onun belə etdiyini görsəm, boynundan basıb üz-gözünü torpağa bulaşdıracağam!" Peyğəmbər ﷺ gəlib namaz qılmağa başladı və Əbu Cəhl dediyini yerinə yetirmək üçün ona tərəf yaxınlaşdı. Lakin hər dəfə onun üstünə cumanda əlləri ilə özünü müdafiə edərək arxaya çəkildi. Əbu Cəhldən: "Sənə nə olub?"– deyə soruşdular. Dedi: "Onunla mənim aramda çox vahiməli, atəşli bir xəndək və (əcaib) qanadlar var idi". Peyğəmbər ﷺ buyurdu: "Əgər o mənə yaxınlaşsaydı, mələklər onu didib parça-parça edərdilər!" (Səhih Muslim)

# سُورَةُ الكَوْثَرِ

## əl-Kovsər surəsi

### ٨٢– باب

### 82-ci fəsil

١٧٩٥ – عَنْ أَنَسٍ ﷺ قَالَ: لَمَّا عُرِجَ بِالنَّبِيِّ ﷺ إِلَى السَّمَاءِ قَالَ أَتَيْتُ عَلَى نَهَرٍ حَافَتَاهُ قِبَابُ اللُّؤْلُؤِ مُجَوَّفًا فَقُلْتُ مَا هَذَا يَا جِبْرِيلُ قَالَ هَذَا الْكَوْثَرُ. [رواه البخاري: ٤٩٦٤]

**1795.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Peyğəmbər ﷺ (merac gecəsi[1]) göyə qalxmış (və geri qayıtdıqda belə) demişdir: "Mən orada hər iki sahilində içi-boş mirvarilərdən hazırlanmış çadırlar düzülmüş (göz oxşayan) bir çayın yanına gəlib çatdım və dedim: "Ey Cəbrail, bu nə (çaydır)?" Dedi: "Bu, Kovsərdir!" (əl-Buxari, 4964)

١٧٩٦ – عَنْ عَائِشَةَ ﷺ قَالَ: سُئِلَتْ عَنْ قَوْلِهِ تَعَالَى: ﴿إِنَّآ أَعْطَيْنَٰكَ ٱلْكَوْثَرَ﴾ قَالَتْ: نَهَرٌ أُعْطِيَهُ نَبِيُّكُمْ ﷺ شَاطِئَاهُ عَلَيْهِ دُرٌّ مُجَوَّفٌ آنِيَتُهُ كَعَدَدِ النُّجُومِ. [رواه البخاري: ٤٩٦٥]

**1796.** Rəvayət edilir ki, Aişəyə ﷺ (Uca Allahın): **"Həqiqətən, Biz Kovsəri sənə bağışladıq"** ayəsi barəsində sual verilmiş və o, belə cavab vermişdir: "Bu, Peyğəmbərinizə ﷺ bəxş edilmiş elə bir çaydır ki, onun hər iki sahilində içi-boş mirvarilərdən hazırlanmış çadırlar və (göydəki) ulduzlar qədər çoxlu qədəhlər düzülmüşdür." (əl-Buxari, 4965)

# سُورَةُ الفَلَقِ

## əl-Fələq surəsi

١٧٩٧ – عَنْ أُبَيِّ بْنِ كَعْبٍ ﷺ قَالَ: سَأَلْتُ رَسُولَ اللَّهِ ﷺ فَقَالَ: قِيلَ لِي فَقُلْتُ فَنَحْنُ نَقُولُ كَمَا قَالَ رَسُولُ اللَّهِ ﷺ. [رواه البخاري: ٤٩٧٦]

**1797.** Rəvayət edilir ki, Ubey ibn Kəb ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərdən ﷺ (şərdən qoruyan surələr[2]) barədə soruşdum. Dedi: "Mənə vəhy olundu, mən də onu insanlara təbliğ etdim." Biz də (bu surələri) Peyğəmbər ﷺ dediyi kimi təbliğ edirik." (əl-Buxari, 4976)

---

[1] 1582-ci hədisə bax.
[2] Yəni "əl-İxlas", "əl-Fələq" və "ən-Nas" surələrini.

# ٦٦- كِتَابُ فَضَائِلُ القُرْآنِ

# 66 – Quranın məziyyətləri kitabı

## ١- باب: كَيْفَ نَزَلَ الْوَحْيُ وَأَوَّلُ مَا نَزَلَ

## 1-ci fəsil. Vəhy necə nazil edilmiş və ilk əvvəl hansı ayələr nazil olmuşdur

١٧٩٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ مَا مِنْ الأَنْبِيَاءِ نَبِيٌّ إِلاَّ أُعْطِيَ مَا مِثْلُهُ آمَنَ عَلَيْهِ الْبَشَرُ وَإِنَّمَا كَانَ الَّذِي أُوتِيتُ وَحْيًا أَوْحَاهُ اللَّهُ إِلَيَّ فَأَرْجُو أَنْ أَكُونَ أَكْثَرَهُمْ تَابِعًا يَوْمَ الْقِيَامَةِ. [رواه البخاري: ٤٩٨١]

**1798.** Əbu Hureyrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Peyğəmbərlərdən elə bir peyğəmbər olmamışdır ki, ona inandığı möcüzələrdən (bir və ya da çox möcüzə) verilmiş olmasın. (Möcüzə olaraq) mənə verilmiş şey isə Allahın mənə vəhy etdiyi Qurandır. Mən ümid edirəm ki, Qiyamət günü mənim ardıcıllarım onların hamısından çox olacaq". (əl-Buxari, 4981)

١٧٩٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّ اللَّهَ تَعَالَى تَابَعَ عَلَى رَسُولِهِ ﷺ الْوَحْيَ قَبْلَ وَفَاتِهِ حَتَّى تَوَفَّاهُ أَكْثَرَ مَا كَانَ الْوَحْيُ ثُمَّ تُوُفِّيَ رَسُولُ اللَّهِ ﷺ بَعْدُ. [رواه البخاري: ٤٩٨٢]

**1799.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbərinin ﷺ vəfatından əvvəl Uca Allah ona ardıcıl olaraq vəhy nazil etdi. Nəhayət, onun vəfatına az qalmış Allah ona lap çox vəhy nazil etməyə başladı. Bundan sonra Allahın rəsulu ﷺ vəfat etdi." (əl-Buxari, 4982)

## ٢- باب: أُنْزِلَ الْقُرْآنُ عَلَى سَبْعَةِ أَحْرُفٍ

## 2-ci fəsil. Quran yeddi qiraət[1] üzərində nazil olmuşdur

١٨٠٠ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ ﷺ قَالَ: سَمِعْتُ هِشَامَ بْنَ حَكِيمِ بْنِ حِزَامٍ يَقْرَأُ سُورَةَ الْفُرْقَانِ فِي حَيَاةِ رَسُولِ اللَّهِ ﷺ فَاسْتَمَعْتُ لِقِرَاءَتِهِ فَإِذَا هُوَ يَقْرَأُ عَلَى حُرُوفٍ كَثِيرَةٍ لَمْ يُقْرِئْنِيهَا رَسُولُ اللَّهِ ﷺ فَكِدْتُ أُسَاوِرُهُ فِي الصَّلاَةِ فَتَصَبَّرْتُ حَتَّى سَلَّمَ فَلَبَّبْتُهُ بِرِدَائِهِ فَقُلْتُ مَنْ أَقْرَأَكَ هَذِهِ السُّورَةَ الَّتِي سَمِعْتُكَ تَقْرَأُ قَالَ أَقْرَأَنِيهَا رَسُولُ اللَّهِ ﷺ فَقُلْتُ كَذَبْتَ فَإِنَّ رَسُولَ اللَّهِ ﷺ قَدْ أَقْرَأَنِيهَا عَلَى غَيْرِ مَا قَرَأْتَ فَانْطَلَقْتُ بِهِ أَقُودُهُ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقُلْتُ إِنِّي سَمِعْتُ هَذَا يَقْرَأُ بِسُورَةِ الْفُرْقَانِ عَلَى حُرُوفٍ لَمْ تُقْرِئْنِيهَا فَقَالَ رَسُولُ اللَّهِ ﷺ أَرْسِلْهُ اقْرَأْ يَا هِشَامُ فَقَرَأَ عَلَيْهِ الْقِرَاءَةَ الَّتِي سَمِعْتُهُ يَقْرَأُ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ كَذَلِكَ أُنْزِلَتْ ثُمَّ قَالَ اقْرَأْ يَا عُمَرُ فَقَرَأْتُ الْقِرَاءَةَ الَّتِي أَقْرَأَنِي فَقَالَ رَسُولُ اللَّهِ ﷺ كَذَلِكَ أُنْزِلَتْ إِنَّ هَذَا الْقُرْآنَ أُنْزِلَ عَلَى سَبْعَةِ أَحْرُفٍ فَاقْرَءُوا مَا تَيَسَّرَ مِنْهُ. [رواه البخاري: ٤٩٩٢]

[1] Allahın Kitabını yeddi müəyyən üsul və qayda ilə oxumaq olar.

**1800.** Rəvayət edilir ki, Ömər ibn Xəttab ﵁ demişdir: “Peyğəmbərin ﷺ sağlığında mən Hişam ibn Həkim ibn Hizamın “əl-Furqan” surəsini oxuduğunu eşitdim və diqqətlə onun oxuduğuna qulaq asmağa başladım. Baxdım ki, o, (bu surəni) başqa-başqa hərflərlə, Peyğəmbərin ﷺ bizə oxumadığı bir üslubla oxuyur. Mən onu elə namazda ikən yaxalamaq istədim, lakin səbir etdim. Nəhayət, o, salam verib (namazını bitirdikdə) mən onun yaxasından yapışıb soruşdum: “Eşitdiyim bu surəni sənə bu cür oxumağı kim öyrədib?” Dedi: “Bu surəni mənə Peyğəmbər ﷺ öyrədib.” Dedim: “Yalan danışırsan, Peyğəmbər ﷺ bu surəni mənə sənin oxuduğun kimi yox, əksinə, başqa cür öyrədib.” Sonra mən onu Peyğəmbərin ﷺ yanına apardım və dedim: “Mən bunun “əl-Furqan” surəsini başqa hərflərlə və sənin bizə öyrətmədiyin bir üslubla oxuduğunu eşitdim.” Peyğəmbər ﷺ buyurdu: “Burax onu! (Sən də) oxu, ey Hişam!” Hişam (bu surəni) ona mənim eşitdiyim qiraətlə oxudu. Peyğəmbər ﷺ dedi: “Bu surə (mənə) bu cür nazil olmuşdur.” Sonra o: “(İndi isə) sən oxu, ey Ömər!”– deyə buyurdu, mən də (bu surəni) onun mənə öyrətdiyi qiraətlə oxudum. Peyğəmbər ﷺ dedi: “Bu surə (mənə) bu cür nazil olmuşdur. Həqiqətən, bu Quran yeddi qiraət üzərində nazil olmuşdur. Odur ki, Qurandan sizə asan olanı oxuyun!” (əl-Buxari, 4992)

## 3-cü fəsil. Cəbrailin Peyğəmbərlə ﷺ birgə Quranı oxuyub təkrar etməsi

## ٣– باب: كَانَ جِبْرِيلُ يَعْرِضُ الْقُرْآنَ عَلَى النَّبِيِّ ﷺ

١٨٠١ – عَنْ فَاطِمَةَ عليها السلام أَسَرَّ إِلَيَّ النَّبِيُّ ﷺ أَنَّ جِبْرِيلَ كَانَ يُعَارِضُنِي بِالْقُرْآنِ كُلَّ سَنَةٍ وَإِنَّهُ عَارَضَنِي الْعَامَ مَرَّتَيْنِ وَلاَ أُرَاهُ إِلاَّ حَضَرَ أَجَلِي. [رواه البخاري: ٤٩٩٦]

**1801.** Rəvayət edilir ki, Fatimə عليها السلام demişdir: “(Bir dəfə) Peyğəmbər ﷺ mənə gizlincə xəbər verib dedi ki: “Cəbrail hər il Quranı mənimlə birgə (yalnız) bir dəfə təkrar edərdi, bu il isə iki dəfə təkrar etdi. Düşünürəm ki, bu mənim əcəlimin yaxınlaşması deməkdir.” (əl-Buxari, 4996)

١٨٠٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُود ﵁ قَالَ: وَاللَّهِ لَقَدْ أَخَذْتُ مِنْ فِي رَسُولِ اللَّهِ ﷺ بِضْعًا وَسَبْعِينَ سُورَةً. وَاللَّهِ لَقَدْ عَلِمَ أَصْحَابُ النَّبِيِّ ﷺ أَنِّي مِنْ أَعْلَمِهِمْ بِكِتَابِ اللَّهِ وَمَا أَنَا بِخَيْرِهِمْ [رواه البخاري: ٥٠٠٠]

**1802.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﵁ demişdir: “Vallahi, mən yetmişdən çox surəni Peyğəmbərin ﷺ dilindən eşidib öyrənmişəm. Vallahi, Peyğəmbərin ﷺ əshabələri yaxşı bilirlər ki, mən Allahın Kitabını onların hamısından yaxşı bilirəm və mən onların ən xeyirlilərindənəm.” (əl-Buxari, 5000)

١٨٠٣ – عَنْ عَلْقَمَةَ قَالَ: كُنَّا بِحِمْصَ فَقَرَأَ ابْنُ مَسْعُود سُورَةَ يُوسُفَ فَقَالَ رَجُلٌ مَا هَكَذَا أُنْزِلَتْ قَالَ قَرَأْتُ عَلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ أَحْسَنْتَ وَوَجَدَ مِنْهُ رِيحَ الْخَمْرِ فَقَالَ أَتَجْمَعُ أَنْ تُكَذِّبَ بِكِتَابِ اللَّهِ وَتَشْرَبَ الْخَمْرَ فَضَرَبَهُ الْحَدَّ. [رواه البخاري: ٥٠٠١]

**1803.** Rəvayət edilir ki, Ələqəmə demişdir: "(Bir dəfə) biz Himsdə ikən ibn Məsud ﷺ bizə "Yusuf" surəsini oxudu. Bu vaxt bir nəfər dedi: "Axı bu surə bu cür nazil olmamışdır." İbn Məsud dedi: "Mən (bu surəni) Allahın elçisinə ﷺ oxudum və (mənə): "Əhsən!"– dedi." Bu vaxt ibn Məsud həmin adamdan şərab iyisi gəldiyini hiss etdi və dedi: "Allahın Kitabına iftira yaxdığın bəs deyil, hələ üstəlik şərab da içirsən?!" Bundan sonra o adamı şallaqladılar." (əl-Buxari, 5001)

## 4-cü fəsil. "De: "O Allah Təkdir!"[1] (surəsinin) məziyyəti

## ٤ – باب: فَضْلُ ﴿قُلْ هُوَ ٱللَّهُ أَحَدٌ﴾

١٨٠٤ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ أَنَّ رَجُلاً سَمِعَ رَجُلاً يَقْرَأُ ﴿قُلْ هُوَ ٱللَّهُ أَحَدٌ﴾ يُرَدِّدُهَا فَلَمَّا أَصْبَحَ جَاءَ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَذَكَرَ ذَلِكَ لَهُ وَكَأَنَّ الرَّجُلَ يَتَقَالُّهَا فَقَالَ رَسُولُ اللَّهِ ﷺ وَالَّذِي نَفْسِي بِيَدِهِ إِنَّهَا لَتَعْدِلُ ثُلُثَ الْقُرْآنِ. [رواه البخاري: ٥٠١٣]

**1804.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, (bir dəfə gecə vaxtı) bir nəfər başqa birisinin: **"De: "O Allah Təkdir..."**– (surəsini) təkrar-təkrar oxuduğunu eşitdi. Səhər açılanda o, Peyğəmbərin ﷺ yanına gəlib eşitdiklərini ona danışdı və sanki həmin adamın bu surəni ucuz tutduğunu bildirmək istədi. Lakin Peyğəmbər ﷺ buyurdu: "Canım Əlində olan Allaha and olsun ki, bu surə Quranın üçdə birinə bərabərdir." (əl-Buxari, 5013)

١٨٠٥ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ لأَصْحَابِهِ أَيَعْجِزُ أَحَدُكُمْ أَنْ يَقْرَأَ ثُلُثَ الْقُرْآنِ فِي لَيْلَةٍ فَشَقَّ ذَلِكَ عَلَيْهِمْ وَقَالُوا أَيُّنَا يُطِيقُ ذَلِكَ يَا رَسُولَ اللَّهِ فَقَالَ اللَّهُ الْوَاحِدُ الصَّمَدُ ثُلُثُ الْقُرْآنِ. [رواه البخاري: ٥٠١٥]

**1805.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ əshabələrinə belə buyurdu: "Hansı biriniz bir gecədə Quranın üçdə birini oxuya bilər?" Bu, əshabələrə ağır gəldi və onlar dedilər: "Bunu hansı birimiz bacara bilər ki, ya Rəsulullah?!" Peyğəmbər ﷺ buyurdu: "Allah Təkdir, Möhtac deyildir" Quranın üçdə birinə bərabərdir." (əl-Buxari, 5015)

## 5-ci fəsil. Şərdən qoruyan surələrin[2] üstünlüyü

## ٥ – باب: فَضْلُ الْمُعَوِّذَاتِ

١٨٠٦ – عَنْ عَائِشَةَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا أَوَى إِلَى فِرَاشِهِ كُلَّ لَيْلَةٍ جَمَعَ كَفَّيْهِ ثُمَّ نَفَثَ فِيهِمَا فَقَرَأَ فِيهِمَا ﴿قُلْ هُوَ ٱللَّهُ أَحَدٌ﴾ وَ ﴿قُلْ أَعُوذُ بِرَبِّ ٱلْفَلَقِ﴾ وَ ﴿قُلْ أَعُوذُ بِرَبِّ ٱلنَّاسِ﴾ ثُمَّ يَمْسَحُ بِهِمَا مَا اسْتَطَاعَ مِنْ جَسَدِهِ يَبْدَأُ بِهِمَا عَلَى رَأْسِهِ وَوَجْهِهِ وَمَا أَقْبَلَ مِنْ جَسَدِهِ يَفْعَلُ ذَلِكَ ثَلَاثَ مَرَّاتٍ. [رواه البخاري: ٥٠١٧]

**1806.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Peyğəmbər ﷺ hər gecə yatağına uzandıqda əllərini cütləşdirib onların içinə üfürər, sonra ora (şərdən qoruyan su-

[1] "əl-İxlas" surəsi.
[2] "əl-İxlas", "əl-Fələq" və "ən-Nas" surələri.

rələri) **– "De: "O Allah Təkdir...", "De: "Sığınıram sübhün Rəbbinə..." və "De: "Sığınıram insanların Rəbbinə..."** oxuyar, daha sonra isə əllərini baş və üz nahiyəsindən başlayaraq bacardığı qədər bədəninin hər yerinə sürtərdi. Beləcə, o, bunu üç dəfə təkrar edərdi." (əl-Buxari, 5017)

## 6-cı fəsil. Quran oxunduğu zaman mələklərin və sükunətin nazil olması

## ٦– باب: نُزُولُ السَّكِينَةِ وَالْمَلاَئِكَةِ عِنْدَ قِرَاءَةِ الْقُرْآنِ

**١٨٠٧ –** عَنْ أُسَيْد بْنِ حُضَيْر ﷺ قَالَ: بَيْنَمَا هُوَ يَقْرَأُ مِنَ اللَّيْلِ سُورَةَ الْبَقَرَة وَفَرَسُهُ مَرْبُوطَةٌ عِنْدَهُ إِذْ جَالَتِ الْفَرَسُ فَسَكَتَ فَسَكَتَتْ فَقَرَأَ فَجَالَتْ الْفَرَسُ فَسَكَتَ وَسَكَتَتْ الْفَرَسُ ثُمَّ قَرَأَ فَجَالَتْ الْفَرَسُ فَانْصَرَفَ وَكَانَ ابْنُهُ يَحْيَى قَرِيبًا مِنْهَا فَأَشْفَقَ أَنْ تُصِيبَهُ فَلَمَّا اجْتَرَّهُ رَفَعَ رَأْسَهُ إِلَى السَّمَاءِ حَتَّى مَا يَرَاهَا فَلَمَّا أَصْبَحَ حَدَّثَ النَّبِيَّ ﷺ فَقَالَ اقْرَأْ يَا ابْنَ حُضَيْرٍ اقْرَأْ يَا ابْنَ حُضَيْرٍ قَالَ فَأَشْفَقْتُ يَا رَسُولَ اللَّهِ أَنْ تَطَأَ يَحْيَى وَكَانَ مِنْهَا قَرِيبًا فَرَفَعْتُ رَأْسِي فَانْصَرَفْتُ إِلَيْهِ فَرَفَعْتُ رَأْسِي إِلَى السَّمَاءِ فَإِذَا مِثْلُ الظُّلَّة فِيهَا أَمْثَالُ الْمَصَابِيحِ فَخَرَجَتْ حَتَّى لاَ أَرَاهَا قَالَ وَتَدْرِي مَا ذَاكَ قَالَ لاَ قَالَ تِلْكَ الْمَلاَئِكَةُ دَنَتْ لِصَوْتِكَ وَلَوْ قَرَأْتَ لأَصْبَحَتْ يَنْظُرُ النَّاسُ إِلَيْهَا لاَ تَتَوَارَى مِنْهُمْ. [رواه البخاري: ٥٠١٨]

**1807.** Rəvayət edilir ki, (bir dəfə) gecə Useyd ibn Hudeyr ﷺ "əl-Bəqərə" surəsini oxuyurdu, atı da onun yanında yerə bağlanılmışdı. Birdən at təşvişə düşüb şahə qalxdı. (Bunu görəndə) Useyd susdu, at da sakitləşdi. Sonra o, oxumağına davam elədi və at yenə təşvişə düşüb şahə qalxdı. O susdu, at da sakitləşdi. Sonra o, yenidən oxumağa başladı və at yenə də həyəcanlanıb şahə qalxdı. Bundan sonra o, daha oxumadı. Həmin vaxt (Useydin) oğlu Yəhya atın yaxınlığında idi və o, qorxdu ki, at onu tapdalayar. Useyd uşağı yanına çəkdikdən sonra başını göyə qaldırdı, lakin aydın bir şey görə bilmədi. Səhəri gün o, bu hadisəni Peyğəmbərə ﷺ danışdı. Peyğəmbər ﷺ (ona): "Oxu, ey ibn Hudeyr! Oxu, ey ibn Hudeyr!"– deyə buyurdu. Useyd dedi: "Ey Allahın elçisi! Yəhya atın yanında idi və mən qorxdum ki, at onu tapdalayar. Odur ki, başımı qaldırıb ona tərəf getdim. Sonra başımı göyə qaldırıb buluda oxşar bir şey, içərisində də qəndillərə[1] bənzər şeylər gördüm. Sonra onlar yox olub getdilər." Peyğəmbər ﷺ soruşdu: "Bilirsənmi o nə idi?" Useyd: "Xeyr!"– deyə cavab verdi. Peyğəmbər ﷺ dedi: "Bu, mələklər idi, sənin səsinə yaxınlaşmışdılar. Əgər sən oxumağına davam etsəydin, səhər tezdən hamı onları görərdi və onlar insanlardan gizlənməzdilər." (əl-Buxari, 5018)

## 7-ci fəsil. Quranı bilən adama qibtə etmək

## ٧– باب: اغْتِبَاطُ صَاحِبِ الْقُرْآنِ

[1] Asma çıraq.

١٨٠٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ لاَ حَسَدَ إِلاَ فِي اثْنَتَيْنِ رَجُلٌ عَلَّمَهُ اللَّهُ الْقُرْآنَ فَهُوَ يَتْلُوهُ آنَاءَ اللَّيْلِ وَآنَاءَ النَّهَارِ فَسَمِعَهُ جَارٌ لَهُ فَقَالَ لَيْتَنِي أُوتِيتُ مِثْلَ مَا أُوتِيَ فُلاَنٌ فَعَمِلْتُ مِثْلَ مَا يَعْمَلُ وَرَجُلٌ آتَاهُ اللَّهُ مَالاً فَهُوَ يُهْلِكُهُ فِي الْحَقِّ فَقَالَ رَجُلٌ لَيْتَنِي أُوتِيتُ مِثْلَ مَا أُوتِيَ فُلاَنٌ فَعَمِلْتُ مِثْلَ مَا يَعْمَلُ. [رواه البخاري: ٥٠٢٦]

**1808.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yalnız iki şəxsə həsəd aparmaq olar: O şəxsə ki, Allah ona Quranı öyrətmiş, o da onu gecə-gündüz oxuyur. Qonşusu bunu eşidib deyər: "Kaş ona verilənin bənzəri mənə də veriləydi, onun etdiyi əməli mən də edərdim." Bir də o şəxsə ki, Allah ona var-dövlət bəxş etmiş, o da onu Allah yolunda lazımi yerlərə xərcləyir. Onu görən adam deyər: "Kaş ona verilənin bənzəri mənə də veriləydi, onun etdiyi əməli mən də edərdim." (əl-Buxari, 5026)

## 8-ci fəsil. Sizin ən xeyirliniz Quranı öyrənən və onu (başqalarına) öyrədən kimsədir

## ٨– باب: خَيْرُكُمْ مَنْ تَعَلَّمَ الْقُرْآنَ وَعَلَّمَهُ

١٨٠٩ – عَنْ عُثْمَانَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: خَيْرُكُمْ مَنْ تَعَلَّمَ الْقُرْآنَ وَعَلَّمَهُ. [رواه البخاري: ٥٠٢٧]

**1809.** Osman ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Sizin ən xeyirliniz Quranı öyrənən və onu başqalarına öyrədən kimsələrdir." (əl-Buxari, 5027)

١٨١٠ – عَنْ عُثْمَانَ بْنِ عَفَّانَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ: إِنَّ أَفْضَلَكُمْ مَنْ تَعَلَّمَ الْقُرْآنَ وَعَلَّمَهُ. [رواه البخاري: ٥٠٢٨]

**1810.** Osman ibn Əffan ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Sizlərdən ən fəzilətlisi Quranı öyrənən və onu başqalarına öyrədən kimsələrdir." (əl-Buxari, 5028)

## 9-cu fəsil. Quranı əzbərləmək və onu mütəmadi olaraq təkrarlamaq

## ٩– باب: اسْتِذْكَارُ الْقُرْآنِ وَتَعَاهُدُهُ

١٨١١ – عَنْ ابْنِ عُمَرَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: إِنَّمَا مَثَلُ صَاحِبِ الْقُرْآنِ كَمَثَلِ صَاحِبِ الإِبِلِ الْمُعَقَّلَةِ إِنْ عَاهَدَ عَلَيْهَا أَمْسَكَهَا وَإِنْ أَطْلَقَهَا ذَهَبَتْ. [رواه البخاري: ٥٠٣١]

**1811.** İbn Ömər rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Quranı əzbərdən bilən adam dəvələrini buxovda saxlayan kimsəyə bənzəyir. Əgər bu adam onları bu vəziyyətdə saxlasa, onları daim özündə saxlamış olar, yox, əgər başlı-başına buraxarsa, onlar qaçıb gedərlər." (əl-Buxari, 5031)

١٨١٢ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ بِئْسَ مَا لأَحَدِهِمْ أَنْ يَقُولَ نَسِيتُ آيَةَ كَيْتَ وَكَيْتَ بَلْ نُسِّيَ وَاسْتَذْكِرُوا الْقُرْآنَ فَإِنَّهُ أَشَدُّ تَفَصِّيًا مِنْ صُدُورِ الرِّجَالِ مِنْ النَّعَمِ. [رواه البخاري: ٥٠٣٢]

**1812.** Abdullah ibn Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Birinizin: "Filan və filan ayəni unutmuşam"– deməsi necə də pisdir! Əksinə, bu ona unutdurulmuşdur. Elə isə Quranı (təkrar-təkrar) öyrənməyə davam edin! Çünki Quran, kəndirdən qırılıb qaçan heyvandan da tez, insanların qəlbini tərk edir." (əl-Buxari, 5032)

١٨١٣ – عَنْ أَبِي مُوسَى ﵁ عَنْ النَّبِيِّ ﷺ قَالَ: تَعَاهَدُوا الْقُرْآنَ فَوَالَّذِي نَفْسِي بِيَدِهِ لَهُوَ أَشَدُّ تَفَصِّيًا مِنْ الإِبِلِ فِي عُقُلِهَا. [رواه البخاري: ٥٠٣٣]

**1813.** Əbu Musa ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Quranı daim oxuyun! Canım Əlində olan Allaha and olsun ki, o, kəndirdən açılıb qaçan dəvədən daha tez (sahibini) tərk edir." (əl-Buxari, 5033)

## 10-cu fəsil. Quran oxuduqda (bəzi sait) səslərin uzadılması

## ١٠– باب: مَدُّ الْقِرَاءَةِ

١٨١٤ – عَنْ أَنَسٍ ﵁ أَنَّهُ سُئِلَ كَيْفَ كَانَتْ قِرَاءَةُ النَّبِيِّ ﷺ فَقَالَ: كَانَتْ مَدًّا ثُمَّ قَرَأَ: ﴿بِسۡمِ ٱللَّهِ ٱلرَّحۡمَٰنِ ٱلرَّحِيمِ﴾ يَمُدُّ بِبِسْمِ اللَّهِ وَيَمُدُّ بِالرَّحْمَنِ وَيَمُدُّ بِالرَّحِيمِ. [رواه البخاري: ٥٠٤٦]

**1814.** Rəvayət edilir ki, Ənəsdən ﵁: "Peyğəmbər ﷺ (Quranı) necə oxuyardı?"– deyə soruşdular. Ənəs: "Uzadaraq!"– deyə cavab verdi, sonra da: "Bismillahir-Rəhmanir-Rəhim" ayəsini – "Bismillah", "ər-Rəhman" və "ər-Rəhim" kəlmələrinin (hər birini) uzadaraq oxudu." (əl-Buxari, 5046)

## 11-ci fəsil. Quranı gözəl səslə oxumaq

## ١١– باب: حُسْنُ الصَّوْتِ بِالْقِرَاءَةِ لِلْقُرْآنِ

١٨١٥ – عَنْ أَبِي مُوسَى ﵁ عَنْ النَّبِيِّ ﷺ قَالَ لَهُ: يَا أَبَا مُوسَى لَقَدْ أُوتِيتَ مِزْمَارًا مِنْ مَزَامِيرِ آلِ دَاوُدَ. [رواه البخاري: ٥٠٤٨]

**1815.** Əbu Musa ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ ona belə demişdir: "Ey Əbu Musa, sənə Davudun ﵇ məlahətli səsi kimi məlahətli bir səs bəxş edilmişdir!" (əl-Buxari, 5048)

## 12-ci fəsil. Quran nə qədər vaxt ərzində oxunmalıdır. Uca Allah buyurur: "Qurandan sizə asan olanı oxuyun!"[1]

## ١٢– باب: فِي كَمْ يُقْرَأُ الْقُرْآنُ وَقَوْلُ اللَّهِ تَعَالَى: ﴿ فَاقْرَءُوا مَا تَيَسَّرَ مِنْهُ ﴾

[1] "əl-Muzzəmmil" surəsi, 20.

١٨١٦ – عَنْ عَبْدِ اللَّه بْنِ عَمْرٍو رضي الله عنهما قَالَ: أَنْكَحَنِي أَبِي امْرَأَةً ذَاتَ حَسَبٍ فَكَانَ يَتَعَاهَدُ كَنَّتَهُ فَيَسْأَلُهَا عَنْ بَعْلِهَا فَتَقُولُ نِعْمَ الرَّجُلُ مِنْ رَجُلٍ لَمْ يَطَأْ لَنَا فِرَاشًا وَلَمْ يُفَتِّشْ لَنَا كَنَفًا مُنْذُ أَتَيْنَاهُ فَلَمَّا طَالَ ذَلِكَ عَلَيْهِ ذَكَرَ لِلنَّبِيِّ ﷺ فَقَالَ الْقَنِي بِهِ فَلَقِيتُهُ بَعْدُ فَقَالَ كَيْفَ تَصُومُ قَالَ كُلَّ يَوْمٍ قَالَ وَكَيْفَ تَخْتِمُ قَالَ كُلَّ لَيْلَةٍ قَالَ صُمْ فِي كُلِّ شَهْرٍ ثَلاَثَةً وَاقْرَإِ الْقُرْآنَ فِي كُلِّ شَهْرٍ قَالَ قُلْتُ أُطِيقُ أَكْثَرَ مِنْ ذَلِكَ قَالَ صُمْ ثَلاَثَةَ أَيَّامٍ فِي الْجُمُعَةِ قُلْتُ أُطِيقُ أَكْثَرَ مِنْ ذَلِكَ قَالَ أَفْطِرْ يَوْمَيْنِ وَصُمْ يَوْمًا قَالَ قُلْتُ أُطِيقُ أَكْثَرَ مِنْ ذَلِكَ قَالَ صُمْ أَفْضَلَ الصَّوْمِ صَوْمَ دَاوُدَ صِيَامَ يَوْمٍ وَإِفْطَارَ يَوْمٍ وَاقْرَأْ فِي كُلِّ سَبْعِ لَيَالٍ مَرَّةً فَلَيْتَنِي قَبِلْتُ رُخْصَةَ رَسُولِ اللَّهِ ﷺ وَذَاكَ أَنِّي كَبِرْتُ وَضَعُفْتُ فَكَانَ يَقْرَأُ عَلَى بَعْضِ أَهْلِهِ السُّبْعَ مِنَ الْقُرْآنِ بِالنَّهَارِ وَالَّذِي يَقْرَؤُهُ يَعْرِضُهُ مِنَ النَّهَارِ لِيَكُونَ أَخَفَّ عَلَيْهِ بِاللَّيْلِ وَإِذَا أَرَادَ أَنْ يَتَقَوَّى أَفْطَرَ أَيَّامًا وَأَحْصَى وَصَامَ مِثْلَهُنَّ كَرَاهِيَةَ أَنْ يَتْرُكَ شَيْئًا فَارَقَ النَّبِيَّ ﷺ عَلَيْهِ. [رواه البخاري: ٥٠٥٢]

**1816.** Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: "(Bir vaxt) atam məni zadəgan bir qadınla evləndirdi. Sonra o, mütamadi olaraq gəlininin yanına gəlib ondan əri[1] barədə soruşur, qadın da hər dəfə ona deyərdi ki: "O, xoşxasiyyət adamdır, lakin mən ona ərə gəldiyim gündən bəri o, nə mənimlə bir yatağa baş qoymuş, nə də mənə toxunmuşdur." Bu hal o vaxta qədər davam etdi ki, axırda atam bu haqda Peyğəmbərə ﷺ xəbər verdi və Peyğəmbər ﷺ (ona): "Qoy (oğlun) mənim yanıma gəlsin!"– dedi. Bundan sonra mən Peyğəmbərin ﷺ yanına getdim və o (məndən) soruşdu: "Sən necə oruc tutursan?" Dedim: "Hər gün." Soruşdu: "Quranı necə xətm edirsən?" Dedim: "Hər gecə." Onda o belə buyurdu: "Hər ay üç gün oruc tut, Quranı da ayda bir dəfə xətm et!" Dedim: "Mənim bundan da çox (ibadət) etməyə gücüm çatar." Dedi: "Həftədə üç gün oruc tut!" Dedim: "Mənim bundan da artığına gücüm çatar." Dedi: "İki gündən bir oruc tut!" Dedim: "Mənim bundan da artığına gücüm çatar." Dedi: "(Elə isə) ən əfzəl orucu – günaşırı oruc tutan Davudun orucunu tut və həftədə bir dəfə (gecələr Quranı başdan axıradək) oxu." Kaş Peyğəmbərin ﷺ verdiyi rüsxəti qəbul edərdim. (İndi) mən artıq qocalıb əldən düşmüşəm."

(Hədisi danışan ravi) demişdir: "Abdullah ibn Amr (özünü yoxlamaq məqsədilə) gündüzlər Quranın yeddidə bir hissəsini əzbərdən (ailə üzvlərindən) birinə danışardı ki, gecələr onu oxumaq ona asan gəlsin. (Oruca gəlincə,) o, özündə güc toplamaq istədikdə bir neçə gün dalbadal oruc tutmazdı və Peyğəmbərin ﷺ zamanında etdiyi əməli tərk etmək istəmədiyindən (buraxdığı günləri) sayıb həmin günlərin sayı qədər oruc tutardı." (əl-Buxari, 5052)

## ١٣– باب: إِثْمُ مَنْ رَاءَى بِقِرَاءَةِ الْقُرْآنِ أَوْ تَأَكَّلَ بِهِ أَوْ فَخَرَ بِهِ

## 13-cü fəsil. Özünü göstərmək, yaxud dünya malı qazanmaq, yaxud da fəxr etmək məqsədilə Quran oxuyan adamın günah qazanması

[1] Burada Abdullah ibn Amr özünü qəsd edir.

١٨١٧ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ أَنَّهُ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: يَخْرُجُ فِيكُمْ قَوْمٌ تَحْقِرُونَ صَلاَتَكُمْ مَعَ صَلاَتِهِمْ وَصِيَامَكُمْ مَعَ صِيَامِهِمْ وَعَمَلَكُمْ مَعَ عَمَلِهِمْ وَيَقْرَءُونَ الْقُرْآنَ لاَ يُجَاوِزُ حَنَاجِرَهُمْ يَمْرُقُونَ مِنَ الدِّينِ كَمَا يَمْرُقُ السَّهْمُ مِنَ الرَّمِيَّةِ يَنْظُرُ فِي النَّصْلِ فَلاَ يَرَى شَيْئًا وَيَنْظُرُ فِي الْقِدْحِ فَلاَ يَرَى شَيْئًا وَيَنْظُرُ فِي الرِّيشِ فَلاَ يَرَى شَيْئًا وَيَتَمَارَى فِي الْفُوقِ. [رواه البخاري: ٥٠٥٨]

**1817.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Vaxt gələcək sizin aranızdan elə insanlar meydana çıxacaq ki, siz onların namazları yanında öz namazlarınızı, orucları yanında öz oruclarınızı, digər əməlləri yanında öz əməllərinizi heç nə sayacaqsınız[1]. Onlar Quran oxuyacaqlar, (amma) oxuduqları (ayələr) xirtdəklərindən o yana keçməyəcəkdir. Ox şikarı dəlib keçdiyi kimi onlar da İslamdan çıxacaqlar[2]. (Necə ki, oxu atan adam) oxun ucuna baxır, lakin heç bir şey görmür, oxun gövdəsinə baxır, yenə də heç bir şey görmür, oxun ləl əkli tərəfinə baxır, yenə də heç bir şey görmür, axırda oxun lap arxasına baxır və (oxun şikara dəyib-dəymədiyinə dair) şübhəyə düşür." (əl-Buxari, 5058)

١٨١٨ – عَنْ أَبِي مُوسَى ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: الْمُؤْمِنُ الَّذِي يَقْرَأُ الْقُرْآنَ وَيَعْمَلُ بِهِ كَالأُتْرُجَّةِ طَعْمُهَا طَيِّبٌ وَرِيحُهَا طَيِّبٌ وَالْمُؤْمِنُ الَّذِي لاَ يَقْرَأُ الْقُرْآنَ وَيَعْمَلُ بِهِ كَالتَّمْرَةِ طَعْمُهَا طَيِّبٌ وَلاَ رِيحَ لَهَا وَمَثَلُ الْمُنَافِقِ الَّذِي يَقْرَأُ الْقُرْآنَ كَالرَّيْحَانَةِ رِيحُهَا طَيِّبٌ وَطَعْمُهَا مُرٌّ وَمَثَلُ الْمُنَافِقِ الَّذِي لاَ يَقْرَأُ الْقُرْآنَ كَالْحَنْظَلَةِ طَعْمُهَا مُرٌّ أَوْ خَبِيثٌ وَرِيحُهَا مُرٌّ. [رواه البخاري: ٥٠٥٩]

**1818.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Quran oxuyan və ona əməl edən mömin turunca[3] bənzəyir, onun dadı da xoşdur, iyi də. Quran oxumayan, amma ona əməl edən mömin xurmaya bənzəyir, onun dadı gözəldir, amma iyisi yoxdur. Quran oxuyan münafiqin məsəli reyhan bitkisinə bənzəyir, onun iyi gözəl olsa da, dadı acıdır. Quran oxumayan münafiqin məsəli acı qovuna bənzəyir, onun iyi xoşagəlməzdir, dadı da acıdır." (əl-Buxari, 5059)

## 14-cü fəsil. Quran xüsusunda canbir qəlb olduqca onu oxuyun

## ١٤ – باب: اقْرَءُوا الْقُرْآنَ مَا ائْتَلَفَتْ عَلَيْهِ قُلُوبُكُمْ

١٨١٩ – عَنْ جُنْدَبِ بْنِ عَبْدِ اللَّهِ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: اقْرَءُوا الْقُرْآنَ مَا ائْتَلَفَتْ قُلُوبُكُمْ فَإِذَا اخْتَلَفْتُمْ فَقُومُوا عَنْهُ. [رواه البخاري: ٥٠٦٠]

[1] Yəni onlar o qədər çox ibadət edəcəklər ki, siz buna baxıb özünüzün onlara nisbətdə az ibadət etdiyinizi güman edəcəksiniz.
[2] 1503-cü və 1672-ci hədisə bax.
[3] Xoşiyli sitrus meyvəsi.

**1819.** Cundəb ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Quran xüsusunda canbir qəlb olduqca onu oxuyun. İxtilafa düşdüyünüz zaman isə söhbətinizə son qoyun[1]". (əl-Buxari, 5060)

[1] Müsəlmanlar Quran ayələrini araşdırıb izah edərkən söylədikləri fikirlər onlarda bir-birilərinə qarşı ədavət yaratmazsa, bu Kitabdan danışa bilərlər. Əks təqdirdə isə bu mövzuya son qoymalıdırlar.

# ٦٧ – كِتَابُ النِّكَاحِ

# 67 – Nikah kitabı

## ١ – باب: التَّرْغِيبُ فِي النِّكَاحِ. لِقَوْلِهِ تَعَالَى: ﴿فَٱنكِحُواْ مَا طَابَ لَكُم مِّنَ ٱلنِّسَآءِ مَثۡنَىٰ وَثُلَٰثَ وَرُبَٰعَ﴾

## 1-ci fəsil. Evlənməyə rəğbət oyatmaq. Uca Allah buyurur: "...xoşunuza gələn *halal* qadınlardan ikisi, üçü və dördü ilə evlənin"[1]

١٨٢٠ – عَنْ أَنَسِ بْنِ مَالِك ﷺ قَالَ: جَاءَ ثَلاَثَةُ رَهْط إِلَى بُيُوت أَزْوَاجِ النَّبِيِّ ﷺ يَسْأَلُونَ عَنْ عِبَادَةِ النَّبِيِّ ﷺ فَلَمَّا أُخْبِرُوا كَأَنَّهُمْ تَقَالُّوهَا فَقَالُوا وَأَيْنَ نَحْنُ مِنْ النَّبِيِّ ﷺ قَدْ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ وَمَا تَأَخَّرَ قَالَ أَحَدُهُمْ أَمَّا أَنَا فَإِنِّي أُصَلِّي اللَّيْلَ أَبَدًا وَقَالَ آخَرُ أَنَا أَصُومُ الدَّهْرَ وَلاَ أُفْطِرُ وَقَالَ آخَرُ أَنَا أَعْتَزِلُ النِّسَاءَ فَلاَ أَتَزَوَّجُ أَبَدًا فَجَاءَ رَسُولُ اللَّهِ ﷺ إِلَيْهِمْ فَقَالَ أَنْتُمْ الَّذِينَ قُلْتُمْ كَذَا وَكَذَا أَمَا وَاللَّهِ إِنِّي لأَخْشَاكُمْ لِلَّهِ وَأَتْقَاكُمْ لَهُ لَكِنِّي أَصُومُ وَأُفْطِرُ وَأُصَلِّي وَأَرْقُدُ وَأَتَزَوَّجُ النِّسَاءَ فَمَنْ رَغِبَ عَنْ سُنَّتِي فَلَيْسَ مِنِّي. [رواه البخاري: ٥٠٦٣]

**1820.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) üç nəfər Peyğəmbərin ﷺ evinə gəlib onun əhli-əyalından Peyğəmbərin ﷺ ibadəti barəsində soruşdu. Bu haqda onlara xəbər verildikdə onlar (etdikləri ibadətin) az olduğunu güman edib belə dedilər: "Yəni biz Peyğəmbər ﷺ kimi ola bilərikmi? Üstəlik Allah onun bütün keçmiş və gələcək xətalarını bağışlamışdır." Onlardan birisi dedi: "Mən bütün gecələri ibadət edəcəyəm, yatmayacağam." O birisi dedi: "Mən il boyu oruc tutacağam, (gündüzlər) yemək yeməyəcəyəm." Üçüncüsü dedi: "Mən qadınlara yaxın durmayacağam, heç vaxt evlənməyəcəyəm." Peyğəmbər ﷺ (bunu eşidəndən sonra) onların yanına gəlib dedi: "Filan, filan sözləri sizmi demisiniz?! Vallahi ki, aranızda Allahdan ən çox qorxanınız mənəm. Bununla belə mən bəzən oruc tutur, bəzən də tutmuram, gecənin bir vaxtını namaz qılır, digərində isə dincəlirəm və nəhayət, mən qadınlarla evlənirəm. Belə olduğu halda mənim yolumdan çıxan kimsələr məndən deyildirlər." (əl-Buxari, 5063)

## ٢ – باب: مَا يُكْرَهُ مِنْ التَّبَتُّلِ وَالْخِصَاء

## 2-ci fəsil. Subay qalmağın, habelə axtalanmağın bəyənilməməsi

١٨٢١ – عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ﷺ قَالَ: رَدَّ رَسُولُ اللَّهِ ﷺ عَلَى عُثْمَانَ بْنِ مَظْعُونٍ التَّبَتُّلَ وَلَوْ أَذِنَ لَهُ لاَخْتَصَيْنَا. [رواه البخاري: ٥٠٧٣]

**1821.** Rəvayət edilir ki, Səd ibn Əbu Vəqqas ﷺ demişdir: "Peyğəmbər ﷺ Osman ibn Məzuna evlənməkdən boyun qaçırmağı qadağan etdi. Əgər Peyğəmbər ﷺ ona (bu işdə) izn versəydi, biz özümüzü axtalayardıq." (əl-Buxari, 5073)

[1] "ən-Nisa" surəsi, 3.

١٨٢٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ قُلْتُ يَا رَسُولَ اللَّهِ إِنِّي رَجُلٌ شَابٌّ وَأَنَا أَخَافُ عَلَى نَفْسِي الْعَنَتَ وَلاَ أَجِدُ مَا أَتَزَوَّجُ بِهِ النِّسَاءَ فَسَكَتَ عَنِّي ثُمَّ قُلْتُ مِثْلَ ذَلِكَ فَسَكَتَ عَنِّي ثُمَّ قُلْتُ مِثْلَ ذَلِكَ فَسَكَتَ عَنِّي ثُمَّ قُلْتُ مِثْلَ ذَلِكَ فَقَالَ النَّبِيُّ ﷺ يَا أَبَا هُرَيْرَةَ جَفَّ الْقَلَمُ بِمَا أَنْتَ لاَقٍ فَاخْتَصِ عَلَى ذَلِكَ أَوْ ذَرْ. [رواه البخاري: ٥٠٧٦]

**1822.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “(Bir dəfə) mən Peyğəmbərə ﷺ dedim: “Ya Rəsulullah, mən subay oğlanam, qorxuram zina edəm, evlənməyə də imkanım yoxdur. (Bəs mən nə edim?)” Peyğəmbər ﷺ mənə cavab vermədi. Sonra mən ona eyni sualı verdim, (lakin o yenə) mənə cavab vermədi. Mən bir də ona həmin sualı verdim, (amma o yenə) mənə cavab vermədi. Mən sualımı bir daha təkrar etdikdə Peyğəmbər ﷺ buyurdu: “Ey Əbu Hureyra, (bil ki,) axtalansan da, axtalanmasan da, sənin edəcəyin əməlləri (Lövhi-Məhfuza yazmış) qələm qurumuşdur.” (əl-Buxari, 5076)

## ٣– باب: نِكَاحُ الْأَبْكَارِ

## 3-cü fəsil. Bakirə qızlarla nikah bağlamaq

١٨٢٣ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: قُلْتُ يَا رَسُولَ اللَّهِ أَرَأَيْتَ لَوْ نَزَلْتَ وَادِيًا وَفِيهِ شَجَرَةٌ قَدْ أُكِلَ مِنْهَا وَوَجَدْتَ شَجَرًا لَمْ يُؤْكَلْ مِنْهَا فِي أَيِّهَا كُنْتَ تُرْتِعُ بَعِيرَكَ قَالَ فِي الَّذِي لَمْ يُرْتَعْ مِنْهَا تَعْنِي أَنَّ رَسُولَ اللَّهِ ﷺ لَمْ يَتَزَوَّجْ بِكْرًا غَيْرَهَا. [رواه البخاري: ٥٠٧٧]

**1823.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “(Bir dəfə mən Peyğəmbərə ﷺ) dedim: “Ya Rəsulullah! De görüm, əgər sən bir vadiyə enib orada yarpaqlarının bəzisi yeyilmiş, habelə yarpaqlarına toxunulmamış ağaclar görsəydin, yarpaqlarından yemək üçün dəvəni hansı ağacın yanına buraxardın?” Peyğəmbər ﷺ: “Yarpaqlarına toxunulmamış ağaca”– deyə cavab verdi.”

(Hədisi danışan ravi demişdir): “Aişə (bu sualı verdikdə) demək istəyirdi ki, Peyğəmbər ﷺ ondan başqa bakirə qızla evlənməmişdir.” (əl-Buxari, 5077)

## ٤– باب: تَزْوِيجُ الصِّغَارِ مِنْ الْكِبَارِ

## 4-cü fəsil. Azyaşlı bakirə qızlarla evlənmək

١٨٢٤ – عَنْ عُرْوَةَ أَنَّ النَّبِيَّ ﷺ خَطَبَ عَائِشَةَ ﷺ إِلَى أَبِي بَكْرٍ فَقَالَ لَهُ أَبُو بَكْرٍ إِنَّمَا أَنَا أَخُوكَ فَقَالَ أَنْتَ أَخِي فِي دِينِ اللَّهِ وَكِتَابِهِ وَهِيَ لِي حَلاَلٌ. [رواه البخاري: ٥٠٨١]

**1824.** Urva rəvayət etmişdir ki, Peyğəmbər ﷺ Əbu Bəkrin ﷺ yanına gəlib ona Aişəni almaq istədiyini bildirdikdə, Əbu Bəkr ﷺ dedi: “Axı, mən sənin qardaşınam!” Peyğəmbər ﷺ buyurdu: “Sən Allahın dininə və Kitabına görə mənim qardaşımsan. (Aişə ilə evlənməyə gəldikdə isə,) o mənə halaldır.” (əl-Buxari, 5081)

## ٥– باب: الأَكْفَاءُ فِي الدِّينِ

## 5-ci fəsil. Dində (zövcələrə) eyni münasibət bəsləmək

١٨٢٥ – عَنْ عَائِشَةَ ﵂ أَنَّ أَبَا حُذَيْفَةَ بْنَ عُتْبَةَ بْنِ رَبِيعَةَ بْنِ عَبْدِ شَمْسٍ وَكَانَ مِمَّنْ شَهِدَ بَدْرًا مَعَ النَّبِيِّ ﷺ تَبَنَّى سَالِمًا وَأَنْكَحَهُ بِنْتَ أَخِيهِ هِنْدَ بِنْتَ الْوَلِيدِ بْنِ عُتْبَةَ بْنِ رَبِيعَةَ وَهُوَ مَوْلًى لِامْرَأَةٍ مِنَ الأَنْصَارِ كَمَا تَبَنَّى النَّبِيُّ ﷺ زَيْدًا وَكَانَ مَنْ تَبَنَّى رَجُلاً فِي الْجَاهِلِيَّةِ دَعَاهُ النَّاسُ إِلَيْهِ وَوَرِثَ مِنْ مِيرَاثِهِ حَتَّى أَنْزَلَ اللَّهُ: ﴿ٱدْعُوهُمْ لِآبَآئِهِمْ﴾ إِلَى قَوْلِهِ ﴿وَمَوَٰلِيكُمْ﴾ فَرُدُّوا إِلَى آبَائِهِمْ فَمَنْ لَمْ يُعْلَمْ لَهُ أَبٌ كَانَ مَوْلًى وَأَخًا فِي الدِّينِ فَجَاءَتْ سَهْلَةُ بِنْتُ سُهَيْلِ بْنِ عَمْرٍو الْقُرَشِيِّ ثُمَّ الْعَامِرِيِّ وَهِيَ امْرَأَةُ أَبِي حُذَيْفَةَ بْنِ عُتْبَةَ النَّبِيَّ ﷺ فَقَالَتْ: يَا رَسُولَ اللَّهِ إِنَّا كُنَّا نَرَى سَالِمًا وَلَدًا وَقَدْ أَنْزَلَ اللَّهُ فِيهِ مَا قَدْ عَلِمْتَ. [رواه البخاري: ٥٠٨٨]

**1825.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ Zeydi oğulluğa götürdüyü kimi Peyğəmbərlə ﷺ birlikdə Bədrdə iştirak etmiş Əbu Huzeyfə ibn Utbə ibn Rəbiə ibn Abduşəms də ənsardan olan bir qadının köləlikdən azad etdiyi Salimi oğulluğa götürmüş və onu qardaşı qızı Hind bint Vəlid ibn Utbə ibn Rəbiə ilə evləndirmişdi. Cahiliyyə dövründə bir adam kimisə oğulluğa götürərdisə, insanlar uşağın həmin adamın oğlu olduğunu iddia edər və onun qoyub getdiyi mirasdan oğulluğuna da pay düşərdi. Nəhayət, Allah (bu ayəni) nazil etdi: ***“Oğulluğa götürdüyünüz uşaqları* öz atalarının adları ilə çağırın. Bu, Allah yanında daha ədalətlidir. Atalarını tanımasanız, onlar sizin din qardaşlarınız və yaxınlarınızdır.”**[1] Beləliklə də, oğulluğa götürülən kimsələri öz atalarının adı ilə çağırmağa başladılar, atalarının kim olduğu bilinməyən kimsələri isə yaxın adam və din qardaşı hesab etdilər. O vaxt Əbu Huzeyfə ibn Utbənin həyat yoldaşı Səhlə bint Suheyl ibn Amr əl-Qureşi əl-Amiri Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah, biz Salimin oğlumuz olduğunu güman edirdik. İndi isə Allah bu xüsusda sənə bildiyin bu ayəni nazil etdi...[2]” (əl-Buxari, 5088)

١٨٢٦ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: دَخَلَ رَسُولُ اللَّهِ ﷺ عَلَى ضُبَاعَةَ بِنْتِ الزُّبَيْرِ فَقَالَ لَهَا لَعَلَّكِ أَرَدْتِ الْحَجَّ قَالَتْ وَاللَّهِ لاَ أَجِدُنِي إِلاَّ وَجِعَةً فَقَالَ لَهَا حُجِّي وَاشْتَرِطِي وَقُولِي اللَّهُمَّ مَحِلِّي حَيْثُ حَبَسْتَنِي وَكَانَتْ تَحْتَ الْمِقْدَادِ بْنِ الأَسْوَدِ. [رواه البخاري: ٥٠٨٩]

**1826.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ Dubaə bint Zubeyrin yanına gəlib ona dedi: “Deyəsən, sən həccə getmək istəyirsən?” Qadın dedi: “Vallahi, mən özümü çox pis hiss edirəm.” Peyğəmbər ﷺ buyurdu: “Sən həccini yerinə yetir və: “Allahım, Sən məni harada dayandırsan, orada ihramdan çıxacağam!”[3] deyərək şərt kəs. Bu qadın Miqdad ibn Əsvədin arvadı idi.” (əl-Buxari, 5089)

١٨٢٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ عَنِ النَّبِيِّ ﷺ قَالَ تُنْكَحُ الْمَرْأَةُ لأَرْبَعٍ لِمَالِهَا وَلِحَسَبِهَا وَجَمَالِهَا وَلِدِينِهَا فَاظْفَرْ بِذَاتِ الدِّينِ تَرِبَتْ يَدَاكَ. [رواه البخاري: ٥٠٩٠]

[1] “əl-Əhzab” surəsi, 5.

[2] Başqa bir hədisdə rəvayət edilir ki: “Səhlə ﵂ soruşdu: “Bu haqda nə deyə bilərsən?” Peyğəmbər ﷺ: “Onu əmizdir!”- deyə buyurdu. (Səhlə ﵂) onu beş dəfə əmizdirdikdən sonra o, uşağın süd anası sayıldı.” (Sünən Əbu Davud)

[3] Yəni harada vəziyyətim ağırlaşarsa, orada ziyarətimi tamamlayacağam. Ərəbcə bu belə ifadə edilir: “Allahummə, məhilli heysu həbəstəni.”

**1827.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Dörd şeyə görə qadınla evlənməyə dəyər: var-dövlətinə görə, əsil-nəsəbinə görə, gözəlliyinə görə və bir də dininə görə. Çalış dindar olanı seçəsən, yoxsa yazıq olarsan.” (əl-Buxari, 5090)

١٨٢٨ – عَنْ سَهْلٍ ﷺ قَالَ: مَرَّ رَجُلٌ عَلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ مَا تَقُولُونَ فِي هَذَا قَالُوا حَرِيٌّ إِنْ خَطَبَ أَنْ يُنْكَحَ وَإِنْ شَفَعَ أَنْ يُشَفَّعَ وَإِنْ قَالَ أَنْ يُسْتَمَعَ قَالَ ثُمَّ سَكَتَ فَمَرَّ رَجُلٌ مِنْ فُقَرَاءِ الْمُسْلِمِينَ فَقَالَ مَا تَقُولُونَ فِي هَذَا قَالُوا حَرِيٌّ إِنْ خَطَبَ أَنْ لاَ يُنْكَحَ وَإِنْ شَفَعَ أَنْ لاَ يُشَفَّعَ وَإِنْ قَالَ أَنْ لاَ يُسْتَمَعَ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ هَذَا خَيْرٌ مِنْ مِلْءِ الأَرْضِ مِثْلَ هَذَا. [رواه البخاري: ٥٠٩١]

**1828.** Rəvayət edilir ki, Səhl ﷺ demişdir: “(Bir dəfə varlı) bir adam Peyğəmbərin ﷺ yanından keçərkən Peyğəmbər ﷺ soruşdu: “Bu adam[1] haqda nə deyə bilərsiniz?” Əshabələr dedilər: “(Bu adam) elçi düşdükdə (dilədiyi) qadını alar, havadarlıq etdikdə havadarlığı qəbul olunar, danışanda sözünə qulaq asılar.” (Peyğəmbər ﷺ) heç nə demədi. Sonra kasıb müsəlmanlardan bıri onun yanından keçdi və Peyğəmbər ﷺ (yenə): “Bu adam haqda nə deyə bilərsiniz?”– deyə soruşdu. Onlar dedilər: “(Bu adam) elçi düşdükdə (dilədiyi) qadın ona verilməz, havadarlıq (istəyən kimi) havadarlığı qəbul olunmaz, danışanda (hər sözünə) qulaq asılmaz.” (Bunu eşidəndə) Peyğəmbər ﷺ buyurdu: “Bu (fağır) yer üzündə olan belə (varlıların) hamısından xeyirlidir.” (əl-Buxari, 5091)

## ٦ – باب: مَا يُتَّقَى مِنْ شُؤْمِ الْمَرْأَةِ وَقَوْلُهُ تَعَالَى: ﴿إِنَّ مِنْ أَزْوَٰجِكُمْ وَأَوْلَٰدِكُمْ عَدُوًّا لَّكُمْ﴾

## 6-cı fəsil. Qadının yaramazlığından ehtiyat etmək. Uca Allah buyurur: “Şübhəsiz ki, zövcələrinizdən və övladınızdan sizə düşmən olanlar da vardır.”[2]

١٨٢٩ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: مَا تَرَكْتُ بَعْدِي فِتْنَةً أَضَرَّ عَلَى الرِّجَالِ مِنَ النِّسَاءِ. [رواه البخاري: ٥٠٩٦]

**1829.** Usamə ibn Zeyd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən özümdən sonra kişilər üçün ehtiyat etdiyim ən təhlükəli fitnə qadınlardır.” (əl-Buxari, 5096)

## ٧ – باب: ﴿وَأُمَّهَٰتُكُمُ ٱلَّٰتِيٓ أَرْضَعْنَكُمْ﴾ وَيَحْرُمُ مِنَ الرَّضَاعَةِ مَا يَحْرُمُ مِنَ النَّسَبِ

## 7-ci fəsil. (Uca Allah buyurur): “...sizi əmizdirən süd analarınız,..”[3] Qan qohumlarına bir-birilərı ilə evlənmək haram buyurulduğu kimi süd qohumlarına da bu, haram buyrulmuşdur

[1] Burada həmin varlı adam nəzərdə tutulur.
[2] “ət-Təğabun” surəsi, 14.
[3] “ən-Nisa” surəsi, 23.

١٨٣٠ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قِيلَ لِلنَّبِيِّ ﷺ أَلاَ تَتَزَوَّجُ ابْنَةَ حَمْزَةَ قَالَ إِنَّهَا ابْنَةُ أَخِي مِنْ الرَّضَاعَةِ. [رواه البخاري: ٥١٠٠]

**1830.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "(Bir dəfə) Peyğəmbərə ﷺ dedilər: "Bəlkə Həmzənin qızını alasan?" O belə cavab verdi: "Axı, o, mənim süd qardaşımın qızıdır!" (əl-Buxari, 5100)

١٨٣١ – عَنْ عَائِشَةَ رضي الله عنها زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ عِنْدَهَا وَأَنَّهَا سَمِعَتْ صَوْتَ رَجُلٍ يَسْتَأْذِنُ فِي بَيْتِ حَفْصَةَ قَالَتْ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ هَذَا رَجُلٌ يَسْتَأْذِنُ فِي بَيْتِكَ فَقَالَ النَّبِيُّ ﷺ أُرَاهُ فُلاَنًا لِعَمِّ حَفْصَةَ مِنْ الرَّضَاعَةِ قَالَتْ عَائِشَةُ لَوْ كَانَ فُلاَنٌ حَيًّا لِعَمِّهَا مِنْ الرَّضَاعَةِ دَخَلَ عَلَيَّ فَقَالَ نَعَمْ الرَّضَاعَةُ تُحَرِّمُ مَا تُحَرِّمُ الْوِلاَدَةُ. [رواه البخاري: ٥٠٩٩]

**1831.** Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ onun yanında ikən bir nəfərin Həfsənin evinə daxil olmaq üçün izn istədiyini eşitdi.

Aişə dedi: "Mən dedim: "Ya Rəsulullah, bu adam sənin evinə girmək üçün izn istəyir." Peyğəmbər ﷺ dedi: "Yəqin ki, bu, filankəsdir"– deyə Həfsənin süd əmisinin adını çəkdi."

Aişə süd əmisinin adını çəkərək soruşdu: "Əgər filankəs sağ olsaydı, mənim yanıma gələ bilərdimi?" Peyğəmbər ﷺ buyurdu: "Bəli, qan qohumlarına haram buyrulan şeylər süd qohumlarına da haram buyrulmuşdur." (əl-Buxari, 5099)

١٨٣٢ – عَنْ أُمِّ حَبِيبَةَ بِنْتِ أَبِي سُفْيَانَ رضي الله عنها قَالَتْ: يَا رَسُولَ اللَّهِ انْكِحْ أُخْتِي بِنْتَ أَبِي سُفْيَانَ فَقَالَ أَوَتُحِبِّينَ ذَلِكِ فَقُلْتُ نَعَمْ لَسْتُ لَكَ بِمُخْلِيَةٍ وَأَحَبُّ مَنْ شَارَكَنِي فِي خَيْرٍ أُخْتِي فَقَالَ النَّبِيُّ ﷺ إِنَّ ذَلِكِ لاَ يَحِلُّ لِي قُلْتُ فَإِنَّا نُحَدَّثُ أَنَّكَ تُرِيدُ أَنْ تَنْكِحَ بِنْتَ أَبِي سَلَمَةَ قَالَ بِنْتَ أُمِّ سَلَمَةَ قُلْتُ نَعَمْ فَقَالَ لَوْ أَنَّهَا لَمْ تَكُنْ رَبِيبَتِي فِي حَجْرِي مَا حَلَّتْ لِي إِنَّهَا لاَبْنَةُ أَخِي مِنْ الرَّضَاعَةِ أَرْضَعَتْنِي وَأَبَا سَلَمَةَ ثُوَيْبَةُ فَلاَ تَعْرِضْنَ عَلَيَّ بَنَاتِكُنَّ وَلاَ أَخَوَاتِكُنَّ. [رواه البخاري: ٥١٠١]

**1832.** Rəvayət edilir ki, Ummu Həbibə bint Əbu Süfyan رضي الله عنها demişdir: "Ya Rəsulullah, mənim bacımı, Əbu Süfyanın qızını al." Peyğəmbər ﷺ dedi: "Doğrudan sən bunu istəyirsən?" Dedim: "Bəli, axı sənin məndən başqa zövcələrin də var. Mən istəyirəm ki, bacım da bu xeyirə şərik olsun." Peyğəmbər ﷺ dedi: "Bu (cür[1] evlənmək) mənə halal deyildir." Dedim: "Bəs deyirlər sən Əbu Sələmənin qızını almaq istəyirsən." Peyğəmbər ﷺ soruşdu: "Ummu Sələmənin qızını (deyirsən)?" Dedim: "Bəli!" Peyğəmbər ﷺ buyurdu: "Əgər o mənim ögey qızım olmasaydı belə, mənim onunla evlənməyim halal sayılmazdı. Çünki o, mənim süd qardaşımın qızıdır. Məni də, Əbu Sələməni də Suveybə əmizdirmişdir. Odur ki, nə qızlarınızı, nə də bacılarınızı mənə təklif etməyin." (əl-Buxari, 5101)

## ٨– باب: مَنْ قَالَ لاَ رَضَاعَ بَعْدَ حَوْلَيْنِ لِقَوْلِهِ تَعَالَى: ﴿حَوْلَيْنِ كَامِلَيْنِ لِمَنْ أَرَادَ أَن يُتِمَّ ٱلرَّضَاعَةَ﴾ وَمَا يُحَرِّمُ مِنْ قَلِيلِ الرَّضَاعِ

## 8-ci fəsil. Uca Allah: "Analar öz övladlarını tam iki il əmizdirsinlər. *Bu,* əmizdirməni tamamlamaq istəyənlər üçündür..."[2] ayəsinə əsaslanaraq: "İki ildən artıq

[1] Yəni iki bacını birlikdə almaq. Bax: "ən-Nisa" surəsi, 23.
[2] "əl-Bəqərə" surəsi, 233.

**əmizdirmək olmaz" deyən kimsə haqqında. Nə qədər süd vermək evlənməyi haram edir**

وَكَثِيرِهِ

١٨٣٣ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ دَخَلَ عَلَيْهَا وَعِنْدَهَا رَجُلٌ فَكَأَنَّهُ تَغَيَّرَ وَجْهُهُ كَأَنَّهُ كَرِهَ ذَلِكَ فَقَالَتْ إِنَّهُ أَخِي فَقَالَ انْظُرْنَ مَنْ إِخْوَانُكُنَّ فَإِنَّمَا الرَّضَاعَةُ مِنْ الْمَجَاعَةِ. [رواه البخاري: ٥١٠٢]

**1833.** Aişədən ﵂ rəvayət edilir ki, (bir dəfə) Peyğəmbər ﷺ onun evinə daxil olduqda, yanında bir kişi olduğunu gördü və çöhrəsi dəyişdi, sanki bu onun xoşuna gəlmədi. Onda Aişə dedi: "O mənim qardaşımdır." Peyğəmbər ﷺ buyurdu: "Kimləri qardaş saydığınıza diqqət yetirin. Belə ki, süd qohumluğu ancaq (o halda etibarlı sayıla bilər ki, uşaq) doyunca süd əmmiş olsun.[1]" (əl-Buxari, 5102)

## 9-cu fəsil. Qadını bibisinin ərdə olduğu kişiyə ərə vermək olmaz[2]

## ٩– باب: لاَ تُنْكَحُ الْمَرْأَةُ عَلَى عَمَّتِهَا

١٨٣٤ – عَنْ جَابِرٍ رضي الله عنه قَالَ: نَهَى رَسُولُ اللَّهِ ﷺ أَنْ تُنْكَحَ الْمَرْأَةُ عَلَى عَمَّتِهَا أَوْ خَالَتِهَا. [رواه البخاري: ٥١٠٨]

**1834.** Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Peyğəmbər ﷺ qadını bibisinin və ya xalasının ərdə olduğu kişiyə ərə verməyi qadağan etmişdir." (əl-Buxari, 5108)

## 10-cu fəsil. Şiğar[3]

## ١٠– باب: الشِّغَارُ

١٨٣٥ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ الشِّغَارِ. [رواه البخاري: ٥١١٢]

**1835.** İbn Ömər ﵄ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ şiğar (adlanan nikah növünü) qadağan etmişdir." (əl-Buxari, 5112)

## 11-ci fəsil. Peyğəmbərin ﷺ axır-axırda siğəni qadağan etməsi

## ١١– باب: نَهْيُ رَسُولِ اللَّهِ ﷺ عَنْ نِكَاحِ الْمُتْعَةِ آخِرًا

١٨٣٦ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ وَسَلَمَةَ بْنِ الأَكْوَعِ رضي الله عنهما قَالا: كُنَّا فِي جَيْشٍ فَأَتَانَا رَسُولُ رَسُولِ اللَّهِ ﷺ فَقَالَ إِنَّهُ قَدْ أُذِنَ لَكُمْ أَنْ تَسْتَمْتِعُوا فَاسْتَمْتِعُوا. [رواه البخاري: ٥١١٧-٥١١٨]

---

[1] Burada "doyunca" deyildikdə uşağın beş dəfə və bundan artıq süd əmməyi nəzərdə tutulur.

[2] Başqa cür desək, kişi qadını və onun bibisini – ikisini birlikdə ala bilməz.

[3] Bu, İslamaqədərki dövrdə Ərəbistanda yayılmış batil nikah növüdür. Bu nikahda iki kişi öz qızlarını bir-birinə qoyduqları şərtə əsasən, mehrsiz ərə verirlər. Şərt isə belədir ki, onlardan biri digərinə: "Mən sənə öz qızımı ərə verirəm, bir şərtlə ki, sən də mənə öz qızını verəsən" və ya "Mən sənə öz bacımı ərə verirəm, bir şərtlə ki, sən də mənə öz bacını verəsən" və s. Bütün bunlar İslam dini gəldikdən sonra qadağan edilmişdir.

**1836.** Rəvayət edilir ki, Cair ibn Abdullah və Sələmə ibn Əkva ﷺ demişdir: "(Bir dəfə) biz döyüşdə ikən Peyğəmbərin ﷺ göndərdiyi adam bizim yanımıza gəlib dedi: "Sizə müvəqqəti nikah bağlamağa izn verildi, odur ki, (hələlik[1]) bunu edə bilərsiniz." (əl-Buxari, 5117-5118)

## 12-ci fəsil. Qadının əməlisaleh bir adama ona ərə getmək istədiyini təklif etməsi

## ١٢– باب: عَرْضُ الْمَرْأَةِ نَفْسَهَا عَلَى الرَّجُلِ الصَّالِحِ

١٨٣٧ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﷺ أَنَّ امْرَأَةً عَرَضَتْ نَفْسَهَا عَلَى النَّبِيِّ ﷺ فَقَالَ لَهُ رَجُلٌ يَا رَسُولَ اللَّهِ زَوِّجْنِيهَا فَقَالَ مَا عِنْدَكَ قَالَ مَا عِنْدِي شَيْءٌ قَالَ اذْهَبْ فَالْتَمِسْ وَلَوْ خَاتَمًا مِنْ حَدِيدٍ فَذَهَبَ ثُمَّ رَجَعَ فَقَالَ لاَ وَاللَّهِ مَا وَجَدْتُ شَيْئًا وَلاَ خَاتَمًا مِنْ حَدِيدٍ وَلَكِنْ هَذَا إِزَارِي وَلَهَا نِصْفُهُ قَالَ سَهْلٌ وَمَا لَهُ رِدَاءٌ فَقَالَ النَّبِيُّ ﷺ وَمَا تَصْنَعُ بِإِزَارِكَ إِنْ لَبِسْتَهُ لَمْ يَكُنْ عَلَيْهَا مِنْهُ شَيْءٌ وَإِنْ لَبِسَتْهُ لَمْ يَكُنْ عَلَيْكَ مِنْهُ شَيْءٌ فَجَلَسَ الرَّجُلُ حَتَّى إِذَا طَالَ مَجْلِسُهُ قَامَ فَرَآهُ النَّبِيُّ ﷺ فَدَعَاهُ أَوْ دُعِيَ لَهُ فَقَالَ لَهُ مَاذَا مَعَكَ مِنَ الْقُرْآنِ فَقَالَ مَعِي سُورَةُ كَذَا وَسُورَةُ كَذَا لِسُوَرٍ يُعَدِّدُهَا فَقَالَ النَّبِيُّ ﷺ أَمْلَكْنَاكَهَا بِمَا مَعَكَ مِنَ الْقُرْآنِ. [رواه البخاري: ٥١٢١]

**1837.** Səhl ibn Səd ﷺ rəvayət edir ki, (bir dəfə) bir qadın Peyğəmbərə ﷺ onu özünə arvad etməyi təklif etdi. (Lakin Peyğəmbər ﷺ cavab vermədi. Bu vaxt) bir kişi dedi: "Ya Rəsulullah, (istəmirsənsə,) onu mənə ərə ver." Peyğəmbər ﷺ soruşdu: "(Bu qadına) nə verə bilərsən?" O adam: "Mənim heç nəyim yoxdur"– dedi. Peyğəmbər ﷺ buyurdu: "Get, heç olmasa dəmirdən bir üzük gətir." Adam çıxıb getdi. (Bir müddətdən) sonra geri qayıtdı və dedi: "Vallahi ki, mən heç bir şey, hətta dəmir üzük belə tapa bilmədim. Lakin bu mənim izarımdır[2], qoy yarısı onun olsun."

Səhl dedi: "(O vaxt) bu adamın (bədənini qurşaqdan yuxarı örtəcək) bir bürüncəyi belə yox idi." Peyğəmbər ﷺ dedi: "Sənin izarın onun nəyinə lazımdır?! Əgər sən onu geyinsən, bundan ona heç nə çatmayacaq, yox əgər o bunu geyinsə, onda bundan sənə heç nə çatmayacaq[3]". (Bundan sonra) həmin adam (bir kənarda) oturdu və bir müddət keçdikdən sonra ayağa qalxdı. Peyğəmbər ﷺ onu gördükdə yanına çağırdı (yaxud onu Peyğəmbərin ﷺ yanına çağırdılar) və Peyğəmbər ﷺ dedi: "Qurandan nə bilirsən?" Adam: "Filan, filan surələri bilirəm"– deyə bu surələrin adlarını çəkdi. Peyğəmbər ﷺ buyurdu: "Bildiyin surələri (bu qadına öyrətmək) şərtilə onu sənə ərə veririk." (əl-Buxari, 5121)

## 13-cü fəsil. Evlənməmişdən qabaq qadına baxmaq (olar)

## ١٣– باب: النَّظَرُ إِلَى الْمَرْأَةِ قَبْلَ التَّزْوِيجِ

[1] Xeybər döyüşündə isə Peyğəmbər ﷺ bunu qadağan etmişdir. 1643-cü hədisə və onun qeydlərinə bax.
[2] Qurşaqdan aşağını örtmək üçün belə bağlanılan örtük.
[3] Yəni yarımçıq izar heç birinizin işinə yarımayacaq.

١٨٣٨ – عَنْ سَهْلِ بْنِ سَعْد ﷺ أَنَّ امْرَأَةً جَاءَتْ رَسُولَ اللَّه ﷺ فَقَالَتْ يَا رَسُولَ اللَّه جئْتُ لأَهَبَ لَكَ نَفْسِي فَنَظَرَ إِلَيْهَا رَسُولُ اللَّه ﷺ فَصَعَّدَ النَّظَرَ إِلَيْهَا وَصَوَّبَهُ ثُمَّ طَأْطَأَ رَأْسَهُ فَلَمَّا رَأَت الْمَرْأَةُ أَنَّهُ لَمْ يَقْضِ فيهَا شَيْئًا جَلَسَتْ فَقَامَ رَجُلٌ منْ أَصْحَابه فَقَالَ أَيْ رَسُولَ اللَّه إِنْ لَمْ تَكُنْ لَكَ بهَا حَاجَةٌ فَزَوِّجْنيهَا فَقَالَ هَلْ عنْدَكَ منْ شَيْءٍ قَالَ لاَ وَاللَّه يَا رَسُولَ اللَّه قَالَ اذْهَبْ إِلَى أَهْلكَ فَانْظُرْ هَلْ تَجدُ شَيْئًا فَذَهَبَ ثُمَّ رَجَعَ فَقَالَ لاَ وَاللَّه يَا رَسُولَ اللَّه مَا وَجَدْتُ شَيْئًا قَالَ انْظُرْ وَلَوْ خَاتَمًا منْ حَديد فَذَهَبَ ثُمَّ رَجَعَ فَقَالَ لاَ وَاللَّه يَا رَسُولَ اللَّه وَلاَ خَاتَمًا منْ حَديد وَلَكنْ هَذَا إِزَاري قَالَ سَهْلٌ مَا لَهُ رِدَاءٌ فَلَهَا نصْفُهُ فَقَالَ رَسُولُ اللَّه ﷺ مَا تَصْنَعُ بإِزَارِكَ إِنْ لَبِسْتَهُ لَمْ يَكُنْ عَلَيْهَا منْهُ شَيْءٌ وَإِنْ لَبسَتْهُ لَمْ يَكُنْ عَلَيْكَ منْهُ شَيْءٌ فَجَلَسَ الرَّجُلُ حَتَّى طَالَ مَجْلسُهُ ثُمَّ قَامَ فَرَآهُ رَسُولُ اللَّه ﷺ مُوَلِّيًا فَأَمَرَ به فَدُعِيَ فَلَمَّا جَاءَ قَالَ مَاذَا مَعَكَ منَ الْقُرْآن قَالَ مَعي سُورَةُ كَذَا وَسُورَةُ كَذَا عَدَّدَهَا قَالَ أَتَقْرَؤُهُنَّ عَنْ ظَهْرِ قَلْبِكَ قَالَ نَعَمْ قَالَ اذْهَبْ فَقَدْ مَلَّكْتُكَهَا بمَا مَعَكَ منَ الْقُرْآنِ. [رواه البخاري: ٥١٢٦]

**1838.** Səhl ibn Səd ﷺ rəvayət edir ki, (bir dəfə) bir qadın Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, gəlmişəm ki, canımı sənə bağışlayım[1]." Peyğəmbər ﷺ diqqətlə baxıb onu başdan ayağa süzdü, sonra başını aşağı saldı. Qadın Peyğəmbərin ﷺ bir qərar vermədiyini görüb (bir kənarda) əyləşdi. (Bu vaxt) əshabələrindən biri ayağa qalxıb dedi: "Ya Rəsulullah, əgər istəmirsənsə, onu mənə ərə ver." Peyğəmbər ﷺ soruşdu: "(Bu qadına mehr olaraq) bir şey verə bilərsənmi?" (Əshabə): "Xeyr, vallahi ki, (nəsə verməyə imkanım yoxdur) ya Rəsulullah!" Peyğəmbər ﷺ buyurdu: "Get əhli-əyalının yanına, gör bir şey tapa bilirsənmi." Əshabə çıxıb getdi. (Bir müddətdən) sonra geri qayıdıb dedi: "Vallahi ki, mən heç bir şey tapa bilmədim, ya Rəsulullah." Peyğəmbər ﷺ buyurdu: "Bax heç olmasa dəmirdən bir üzük gətir." Əshabə çıxıb getdi. (Bir müddətdən) sonra geri qayıdıb dedi: "Vallahi, ya Rəsulullah, mən heç dəmir üzük belə tapa bilmədim. Lakin bu mənim izarımdır, (qoy yarısı onun olsun)."

Səhl dedi: "(O vaxt) bu adamın bürüncəyi yox idi ki, yarısını ona versin." Peyğəmbər ﷺ dedi: "Sənin izarın onun nəyinə lazımdır?! Əgər sən onu geyinsən, bundan ona heç nə çatmayacaq, yox əgər o bunu geyinsə, onda bundan sənə heç nə çatmayacaq.[2]" (Bundan sonra) həmin adam (bir kənarda) oturdu və bir müddət keçdikdən sonra ayağa qalxdı. Peyğəmbər ﷺ onun çıxıb getmək istədiyini gördükdə yanına çağırtdırdı. Əshabə Peyğəmbərin ﷺ yanına gəldikdə Peyğəmbər ﷺ (ondan) soruşdu: "Qurandan nə bilirsən?" Əshabə: "Filan surəni, filan surəni və filan surəni bilirəm"– deyə bu surələrin adlarını çəkdi. Peyğəmbər ﷺ soruşdu: "Bunları ona əzbərlədərsənmi?" Əshabə: "Bəli!"– deyə cavab verdi. Peyğəmbər ﷺ buyurdu: "Get, bildiyin surələri (bu qadına öyrətmək) şərtilə onu sənə ərə verirəm." (əl-Buxari, 5126)

---

[1] Yəni, istəyirəm ki, məni özünə arvad edəsən.
[2] Yəni yarımçıq izar heç birinizin işinə yarımayacaq.

## 14-cü fəsil. "Hamisiz[1] nikah bağlamaq olmaz" deyən kimsə haqqında

## ١٤- باب: مَنْ قَالَ لاَ نِكَاحَ إِلاَّ بِوَلِيٍّ

١٨٣٩ – عَنْ مَعْقِلِ بْنِ يَسَارٍ ﷺ قَالَ: زَوَّجْتُ أُخْتًا لِي مِنْ رَجُلٍ فَطَلَّقَهَا حَتَّى إِذَا انْقَضَتْ عِدَّتُهَا جَاءَ يَخْطُبُهَا فَقُلْتُ لَهُ زَوَّجْتُكَ وَفَرَشْتُكَ وَأَكْرَمْتُكَ فَطَلَّقْتَهَا ثُمَّ جِئْتَ تَخْطُبُهَا لاَ وَاللَّهِ لاَ تَعُودُ إِلَيْكَ أَبَدًا وَكَانَ رَجُلاً لاَ بَأْسَ بِهِ وَكَانَتْ الْمَرْأَةُ تُرِيدُ أَنْ تَرْجِعَ إِلَيْهِ فَأَنْزَلَ اللَّهُ هَذِهِ الآيَةَ: ﴿فَلَا تَعْضُلُوهُنَّ﴾ فَقُلْتُ الآنَ أَفْعَلُ يَا رَسُولَ اللَّهِ قَالَ فَزَوَّجَهَا إِيَّاهُ. [رواه البخاري: ٥١٣٠]

**1839.** Rəvayət edilir ki, Məqil ibn Yəsar ﷺ demişdir: "Mən bacımı bir adama ərə verdim. (Lakin bir müddətdən) sonra o, mənim bacımı boşadı. Nəhayət, bacımın iddəsi[2] bitdikdən sonra həmin adam yenə ona elçi düşdü. Onda mən (ona) dedim: "Bacımı sənə ərə verdim, onu sənə arvad elədim və sənə ehtiram göstərdim, sən isə onu boşadın. İndi (nə üzlə) elçi gəlmisən. Yox, vallahi, o heç vaxt sənə qayıtmayacaq." O, pis adam deyildi, üstəlik bacımın da ona qayıtmaq fikri var idi. Onda Uca Allah bu ayəni nazil etdi: **"...o qadınlara yenidən əvvəlki ərlərinə ərə getməyə mane olmayın."**[3] (Ayəni eşitdikdən sonra) dedim: "İndi razıyam, ya Rəsulullah."

(Hədisi danışan ravi demişdir): "Bundan sonra o, bacısını yenidən həmin adama ərə verdi." (əl-Buxari, 5130)

## 15-ci fəsil. Ata və ya başqa birisi bakirə qızı və ya dul qadını ərə verdikdə mütləq onun razılığını almalıdır

## ١٥- باب: لاَ يُنْكِحُ الأَبُ وَغَيْرُهُ الْبِكْرَ وَالثَّيِّبَ إِلاَّ بِرِضَاهَا

١٨٤٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ لاَ تُنْكَحُ الأَيِّمُ حَتَّى تُسْتَأْمَرَ وَلاَ تُنْكَحُ الْبِكْرُ حَتَّى تُسْتَأْذَنَ قَالُوا يَا رَسُولَ اللَّهِ وَكَيْفَ إِذْنُهَا قَالَ أَنْ تَسْكُتَ. [رواه البخاري: ٥١٣٦]

**1840.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Dul qadının fikrini öyrənməyincə, habelə bakirə qızın iznini almayınca onları ərə vermək olmaz." (Əshabələr) dedilər: "Ya Rəsulullah, bakirə qızın izin verməsini necə bilmək olar?" Peyğəmbər ﷺ buyurdu: "Onun susmağı ilə." (əl-Buxari, 5136)

١٨٤١ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: يَا رَسُولَ اللَّهِ إِنَّ الْبِكْرَ تَسْتَحِي قَالَ رِضَاهَا صَمْتُهَا. [رواه البخاري: ٥١٣٧]

**1841.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Ya Rəsulullah, axı, bakirə qız utancaq olur?!" Peyğəmbər ﷺ buyurdu: "O öz razılığını susmağı ilə (bildirir)." (əl-Buxari, 5137)

---

[1] Burada hami deyildikdə qadının yiyəsi – atası, əmisi, qardaşı və s. bunlar kimi yaxın adamları nəzərdə tutulur.

[2] 983-cü hədisin qeydlərinə bax.

[3] "əl-Bəqərə" surəsi, 232.

## 16-cı fəsil. Kişi öz qızını zorla ərə verərsə, onun nikahı rədd edilməlidir

## ١٦– باب: إِذَا زَوَّجَ الرَّجُلُ ابْنَتَهُ وَهِيَ كَارِهَةٌ فَنِكَاحُهُ مَرْدُودٌ

١٨٤٢ – عَنْ خَنْسَاءَ بِنْتِ خِذَامٍ الأَنْصَارِيَّةِ رضي الله عنها أَنَّ أَبَاهَا زَوَّجَهَا وَهْيَ ثَيِّبٌ فَكَرِهَتْ ذَلِكَ فَأَتَتْ رَسُولَ اللَّهِ ﷺ فَرَدَّ نِكَاحَهُ. [رواه البخاري: ٥١٣٨]

**1842.** Rəvayət edilir ki, Xənsa bint Xizam əl-Ənsariyənin رضي الله عنها atası onu dul ikən, razılığı olmadan ərə verdi. Sonra o, Peyğəmbərin ﷺ yanına gəldi və o, həmin nikahı geri qaytardı." (əl-Buxari, 5138)

## 17-ci fəsil. Heç kəs (din) qardaşının nişan qoyduğu qıza nişan aparmamalı, onun (həmin qızla) evlənməyini və ya (ondan) əl çəkəcəyini (gözləməlidir)

## ١٧– باب: لاَ يَخْطُبُ عَلَى خِطْبَةِ أَخِيهِ حَتَّى يَنْكِحَ أَوْ يَدَعَ

١٨٤٣ – عَنِ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ يَبِيعَ بَعْضُكُمْ عَلَى بَيْعِ بَعْضٍ وَلاَ يَخْطُبَ الرَّجُلُ عَلَى خِطْبَةِ أَخِيهِ حَتَّى يَتْرُكَ الْخَاطِبُ قَبْلَهُ أَوْ يَأْذَنَ لَهُ الْخَاطِبُ. [رواه البخاري: ٥١٤٢]

**1843.** Rəvayət edilir ki, ibn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ birinizin qardaşının alveri üstündən alver etməsini, habelə qardaşının nişan qoyduğu qıza, əvvəlki nişanlısı ondan imtina edənədək və ya ona izn verənədək nişan aparmasını qadağan etmişdir." (əl-Buxari, 5142)

## 18-ci fəsil. Nikah bağladıqda qadağan olunmuş şərtlər

## ١٨– باب: الشُّرُوطُ الَّتِي لاَ تَحِلُّ فِي النِّكَاحِ

١٨٤٤ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ لاَ يَحِلُّ لاِمْرَأَةٍ تَسْأَلُ طَلاَقَ أُخْتِهَا لِتَسْتَفْرِغَ صَحْفَتَهَا فَإِنَّمَا لَهَا مَا قُدِّرَ لَهَا. [رواه البخاري: ٥١٥٢]

**1844.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heç bir qadına öz bacısının yerini tutmaq məqsədilə onun boşanmasını tələb etmək halal sayılmaz. (İstənilən halda,) ona yalnız qədərinə yazılmış olan (pay) çatacaq" (əl-Buxari, 5152)

## 19-cu fəsil. Gəlini bəyin otağına gətirən və (Allahdan onlar üçün) xeyir-bərəkət diləyən qadınlar haqqında

## ١٩– باب: النِّسْوَةُ اللاَّتِي يَهْدِينَ الْمَرْأَةَ إِلَى زَوْجِهَا وَدُعَائِهِنَّ بِالْبَرَكَةِ

١٨٤٥ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّهَا زَفَّتْ امْرَأَةً إِلَى رَجُلٍ مِنْ الأَنْصَارِ فَقَالَ نَبِيُّ اللَّهِ ﷺ يَا عَائِشَةُ مَا كَانَ مَعَكُمْ لَهْوٌ فَإِنَّ الأَنْصَارَ يُعْجِبُهُمْ اللَّهْوُ. [رواه البخاري: ٥١٦٢]

**1845.** Rəvayət edilir ki, (bir dəfə) Aişə (r.a.) (başqa qadınlarla birlikdə) bir qadını ənsardan olan bir kişinin otağına apardılar. Sonra Peyğəmbər ﷺ dedi: "Ey Aişə, siz şənlənirdinizmi?![1] Axı, ənsar qadınları şənlənməyi xoşlayırlar." (əl-Buxari, 5162)

## 20-ci fəsil. Kişi həyat yoldaşı ilə yaxınlıq etmək istədikdə nə (dua) oxumalıdır

## ٢٠– باب: مَا يَقُولُ الرَّجُلُ إِذَا أَتَى أَهْلَهُ

١٨٤٦ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ النَّبِيُّ ﷺ أَمَا لَوْ أَنَّ أَحَدَهُمْ يَقُولُ حِينَ يَأْتِي أَهْلَهُ بِاسْمِ اللَّهِ اللَّهُمَّ جَنِّبْنِي الشَّيْطَانَ وَجَنِّبْ الشَّيْطَانَ مَا رَزَقْتَنَا ثُمَّ قُدِّرَ بَيْنَهُمَا فِي ذَلِكَ أَوْ قُضِيَ وَلَدٌ لَمْ يَضُرَّهُ شَيْطَانٌ أَبَدًا. [رواه البخاري: ٥١٦٥]

**1846.** İbn Abbas (r.a.) rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bilin ki, əgər biriniz ailəsi ilə yaxınlıq etməzdən əvvəl: "Bismillah, Allahummə cənnibniş-şeytanə və cənnibiş-şeytanə mə rəzəqtənə!"[2]– desə və əgər onların qismətində varsa, yaxud Allah onların qədərinə övlad yazmışdırsa, şeytan o uşağa heç vaxt zərər toxundura bilməz." (əl-Buxari, 5165)

## 21-ci fəsil. Bir qoyunla da olsa belə, toy-büsat qurmaq

## ٢١– باب: الْوَلِيمَةُ وَلَوْ بِشَاةٍ

١٨٤٧ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: مَا أَوْلَمَ النَّبِيُّ ﷺ عَلَى شَيْءٍ مِنْ نِسَائِهِ مَا أَوْلَمَ عَلَى زَيْنَبَ أَوْلَمَ بِشَاةٍ. [رواه البخاري: ٥١٦٨]

**1847.** Rəvayət edilir ki, Ənəs (r.a.) demişdir: "Peyğəmbərin ﷺ evlənmək münasibətilə verdiyi ən gözəl ziyafəti Zeynəblə evləndikdə verdiyi ziyafət olmuşdur. Onda o bir qoyun kəsmişdir." (əl-Buxari, 5168)

## 22-ci fəsil. Bir qoyundan az (yemək-içməklə) ziyafət verən kimsə haqqında

## ٢٢– باب: مَنْ أَوْلَمَ بِأَقَلَّ مِنْ شَاةٍ

١٨٤٨ – عَنْ صَفِيَّةَ بِنْتِ شَيْبَةَ رضي الله عنها قَالَتْ: أَوْلَمَ النَّبِيُّ ﷺ عَلَى بَعْضِ نِسَائِهِ بِمُدَّيْنِ مِنْ شَعِيرٍ. [رواه البخاري: ٥١٧٢]

---

[1] 527-ci hədisə bax.

[2] Tərcüməsi: Allahın adı ilə! Allahım, məni şeytandan uzaqlaşdır, şeytanı da bizə bəxş etdiyin övladdan uzaqlaşdır!

**1848.** Səfiyyə bint Şeybə ﷺ demişdir: “Peyğəmbər ﷺ bəzi zövcələrinin şərəfinə iki ovuc arpa ilə ziyafət vermişdir.” (əl-Buxari, 5172)

## ٢٣– باب: حَقُّ إِجَابَةِ الْوَلِيمَةِ وَالدَّعْوَةِ وَمَنْ أَوْلَمَ سَبْعَةَ أَيَّامٍ وَنَحْوَهُ

## 23-cü fəsil. Toy şənliyinə və ya başqa qonaqlıqlara çağırıldıqda dəvəti qəbul etmək, habelə yeddi gün və ya buna yaxın bir vaxt ərzində ziyafət verən kimsə haqqında

١٨٤٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ إِذَا دُعِيَ أَحَدُكُمْ إِلَى الْوَلِيمَةِ فَلْيَأْتِهَا. [رواه البخاري: ٥١٧٣]

**1849.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Biriniz toya dəvət edildiyi zaman qoy bu dəvəti qəbul etsin.” (əl-Buxari, 5173)

## ٢٤– باب: الْوَصَاةُ بِالنِّسَاءِ

## 24-cü fəsil. Qadınlara dair tövsiyə

١٨٥٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلاَ يُؤْذِي جَارَهُ وَاسْتَوْصُوا بِالنِّسَاءِ خَيْرًا فَإِنَّهُنَّ خُلِقْنَ مِنْ ضِلَعٍ وَإِنَّ أَعْوَجَ شَيْءٍ فِي الضِّلَعِ أَعْلاَهُ فَإِنْ ذَهَبْتَ تُقِيمُهُ كَسَرْتَهُ وَإِنْ تَرَكْتَهُ لَمْ يَزَلْ أَعْوَجَ فَاسْتَوْصُوا بِالنِّسَاءِ خَيْرًا. [رواه البخاري: ٥١٨٦]

**1850.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim Allaha və Axirət gününə iman gətirirsə, qonşusuna əziyyət verməsin! Qadınlarla da yaxşı davranın! Çünki onlar qabırğadan xəlq edilmişlər. Qabırğanın əyri tərəfi isə yuxarı hissəsidir. Sən onu düzəltmək istəsən, sındıracaqsan, düzəltməsən, əyri qalacaq. Odur ki, qadınlarla yaxşı davranın!” (əl-Buxari, 5186)

## ٢٥– باب: حُسْنُ الْمُعَاشَرَةِ مَعَ الأَهْلِ

## 25-ci fəsil. Həyat yoldaşı ilə xoş rəftar etmək

١٨٥١ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: جَلَسَ إِحْدَى عَشْرَةَ امْرَأَةً فَتَعَاهَدْنَ وَتَعَاقَدْنَ أَنْ لاَ يَكْتُمْنَ مِنْ أَخْبَارِ أَزْوَاجِهِنَّ شَيْئًا قَالَتْ الأُولَى زَوْجِي لَحْمُ جَمَلٍ غَثٍّ عَلَى رَأْسِ جَبَلٍ لاَ سَهْلٍ فَيُرْتَقَى وَلاَ سَمِينٍ فَيُنْتَقَلُ قَالَتْ الثَّانِيَةُ زَوْجِي لاَ أَبُثُّ خَبَرَهُ إِنِّي أَخَافُ أَنْ لاَ أَذَرَهُ إِنْ أَذْكُرْهُ أَذْكُرْ عُجَرَهُ وَبُجَرَهُ قَالَتْ الثَّالِثَةُ زَوْجِي الْعَشَنَّقُ إِنْ أَنْطِقْ أُطَلَّقْ وَإِنْ أَسْكُتْ أُعَلَّقْ قَالَتْ الرَّابِعَةُ زَوْجِي كَلَيْلِ تِهَامَةَ لاَ حَرٌّ وَلاَ قُرٌّ وَلاَ مَخَافَةَ وَلاَ سَآمَةَ قَالَتْ الْخَامِسَةُ زَوْجِي إِنْ دَخَلَ فَهِدَ وَإِنْ خَرَجَ أَسِدَ وَلاَ يَسْأَلُ عَمَّا عَهِدَ قَالَتْ السَّادِسَةُ زَوْجِي إِنْ أَكَلَ لَفَّ وَإِنْ شَرِبَ اشْتَفَّ وَإِنْ اضْطَجَعَ الْتَفَّ وَلاَ يُولِجُ الْكَفَّ لِيَعْلَمَ الْبَثَّ قَالَتْ السَّابِعَةُ زَوْجِي غَيَايَاءُ أَوْ عَيَايَاءُ طَبَاقَاءُ كُلُّ دَاءٍ لَهُ دَاءٌ شَجَّكِ أَوْ فَلَّكِ أَوْ جَمَعَ كُلاًّ لَكِ قَالَتْ الثَّامِنَةُ زَوْجِي الْمَسُّ مَسُّ أَرْنَبٍ وَالرِّيحُ رِيحُ زَرْنَبٍ قَالَتْ التَّاسِعَةُ زَوْجِي رَفِيعُ الْعِمَادِ طَوِيلُ النِّجَادِ عَظِيمُ الرَّمَادِ قَرِيبُ الْبَيْتِ مِنْ النَّادِ قَالَتْ الْعَاشِرَةُ زَوْجِي مَالِكٌ وَمَا مَالِكٌ مَالِكٌ خَيْرٌ مِنْ ذَلِكِ لَهُ إِبِلٌ كَثِيرَاتُ الْمَبَارِكِ قَلِيلاَتُ الْمَسَارِحِ وَإِذَا سَمِعْنَ صَوْتَ الْمِزْهَرِ أَيْقَنَّ أَنَّهُنَّ

هَوَالكُ قَالَتْ الْحَادِيَةَ عَشْرَةَ زَوْجِي أَبُو زَرْعٍ وَمَا أَبُو زَرْعٍ أَنَاسَ مِنْ حُلِيٍّ أُذُنَيَّ وَمَلأَ مِنْ شَحْمٍ عَضُدَيَّ وَبَجَّحَنِي فَبَجحتْ إِلَيَّ نَفْسِي وَجَدَنِي فِي أَهْلِ غُنَيْمَة بشقٍّ فَجعَلَنِي فِي أَهْلِ صَهِيلٍ وَأَطيط وَدَائِسٍ وَمُنَقٍّ فَعِنْدَهُ أَقُولُ فَلاَ أُقَبَّحُ وَأَرْقُدُ فَأَتَصبَّحُ وَأَشْرَبُ فَأَتَقنَّحُ أُمُّ أَبِي زَرْعٍ فَمَا أُمُّ أَبِي زَرْعٍ عُكُومُهَا رَدَاحٌ وَبَيْتُهَا فَسَاحٌ ابْنُ أَبِي زَرْعٍ فَمَا ابْنُ أَبِي زَرْعٍ مَضْجَعُهُ كَمَسَلِّ شَطْبَة وَيُشْبِعُهُ ذِرَاعُ الْجَفْرَة بِنْتُ أَبِي زَرْعٍ فَمَا بِنْتُ أَبِي زَرْعٍ طَوْعُ أَبِيهَا وَطَوْعُ أُمِّهَا وَمِلْءُ كِسَائِهَا وَغَيْظُ جَارَتِهَا جَارِيَةُ أَبِي زَرْعٍ فَمَا جَارِيَةُ أَبِي زَرْعٍ لاَ تَبُثُّ حَدِيثَنَا تَبْثِيثًا وَلاَ تُنَقِّثُ مِيرَتَنَا تَنْقِيثًا وَلا تَمْأُ بَيْتَنَا تَعْشِيشًا قَالَتْ خَرَجَ أَبُو زَرْعٍ وَالأَوْطَابُ تُمْخَضُ فَلَقِيَ امْرَأَةً مَعَهَا وَلَدَان لَهَا كَالْفَهْدَيْنِ يَلْعَبَان مِنْ تَحْت خَصْرِهَا بِرُمَّانَتَيْنِ فَطَلَّقَنِي وَنَكَحَهَا فَنَكَحْتُ بَعْدَهُ رَجُلاً سَرِيًّا رَكِبَ شَرِيًّا وَأَخَذَ خَطِّيًّا وَأَرَاحَ عَلَيَّ نَعَمًا ثَرِيًّا وَأَعْطَانِي مِنْ كُلِّ رَائِحَة زَوْجًا وَقَالَ كُلِي أُمَّ زَرْعٍ وَمِيرِي أَهْلَكِ قَالَتْ فَلَوْ جَمَعْتُ كُلَّ شَيْءٍ أَعْطَانِيه مَا بَلَغَ أَصْغَرَ آنِيَة أَبِي زَرْعٍ قَالَتْ عَائِشَةُ قَالَ رَسُولُ اللَّهِ ﷺ كُنْتُ لَكِ كَأَبِي زَرْعٍ لأُمِّ زَرْعٍ. [رواه البخاري: ٥١٨٩]

**1851.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "(Bir dəfə) on bir qadın bir yerdə oturub öz ərlərinin barəsində olan xəbərlərdən heç bir şey gizlətməyəcəklərinə dair bir-birilərinə söz verdilər. Birincisi dedi: "Mənim ərim dağın zirvəsində yerləşən cılız dəvənin ətinə bənzəyir. O dağa çıxmaq asan iş deyil, üstəlik ətin üstündə piy deyilən şey yoxdur ki, (kimsə gedib onu) götürsün[1]". İkincisi dedi: "Mən ərim haqqında danışmaq istəmirəm. Qorxuram onun haqqında danışmağa başlasam, onun bütün gizli və aşkar nöqsanlarını xatırlamayınca dayanmayım." Üçüncüsü dedi: "Mənim ərim uzundrazdır. Əgər mən (onun qarasınca) danışsam, o məni boşayar, yox, danışmasam, (onda həmişə ondan) asılı vəziyyətdə qalaram." Dördüncüsü dedi: "Mənim ərim Tihamə[2] gecəsinə bənzəyir.[3] O, nə tezqızışan, nə laqeyd, nə qorxunc, nə də zəhlətökən bir adamdır." Beşincisi dedi: "Mənim ərim evə girəndə bəbirə, çölə çıxanda isə şirə dönür və (mənə) tapşırdığı xırda-para işlərə görə (evinə) söz-söhbət salmır." Altıncısı dedi: "Mənim ərim yeyəndə də, içəndə də (süfrədə) heç nə saxlamır. Yatağına uzandıqda bürüncəyinə bürünür və heç əlini uzadıb baxmır ki, görsün yanındayam, ya yox.[4]" Yeddincisi dedi: "Mənim ərim gic-gic işlərlə məşğuldur, (yaxud aciz-avara) və sarsaq adamdır. Nə nöqsan desən onda tapa bilərsən, o sənin başını yara bilər, bədəninə xəsarət yetirə bilər, yaxud hər ikisini edə bilər." Səkkizincisi dedi: "Mənim ərim zərif (vücudlu), dovşan tək zərif, zərnəb[5] qədər xoşiyli bir adamdır." Doqquzuncusu dedi: "Mənim ərim hündür evə sahib olan,[6] belində uzun qın[7] daşıyan, evində çoxlu od qalanan[8] və evi (həmişə) qonaq-qaravaşla dolu olan bir adamdır." Onuncusu dedi: "Mənim ərimin adı Malikdir! (Nə bilirsiniz) Malik kimdir?! (Nə cür vəsf etsəm də,) Malik ondan daha xeyirlidir.

---

[1] Qadın bu məsəllə ərinin tamahkar, dikbaş və qanacaqsız adam olduğunu demək istəmişdir.
[2] Qırmızı dənizin şərq sahili boyu olan ərazidir.
[3] Qadın bu sözlə ərinin gözəl olduğunu bildirmək istəyir.
[4] Burada qadın ərinin acgöz və qarınqulu, həm də ona qarşı çox diqqətsiz olduğunu bildirmək istəyir.
[5] Xoşiyli ot.
[6] Burada qadın ərinin zadəgan ailəsindən olduğunu nəzərdə tutur.
[7] Qadın onun hündürboy olduğunu qəsd edir.
[8] Yəni tez-tez ziyafət verən.

Onun dəvələrinin çoxu ağıllarda[1], az bir qismi isə otlaqlarda olur. (Ağıllardakı) dəvələr ud səsi eşitdikdə boğazlanacaqlarını[2] yəqin edirlər." On birincisi dedi: "Mənim ərim Əbu Zər'idir. (Nə bilirsiniz) Əbu Zər'i kimdir?! O mənim qulaqlarımı zinət əşyaları ilə bəzəmiş, mən (onun qayğısı sayəsində) toppuş olmuş, habelə o mənə sevinc bəxş etmiş və bu mənim könlümü şad etmişdir. O məni bir neçə qoyuna sahib olan ailədən alıb at və dəvə sürüsünə sahib, habelə taxıl döyməklə məşğul olan və tərtəmiz taxıla sahib olan bir ailəyə (gəlin) gətirmişdi. Onun evində danışdığım sözlərə görə heç kəs məni tənbeh etmir, (istəyəndə) günortaya qədər yata bilirəm və istədiyim qədər (süd və s.) içirəm. Əbu Zər'inin anası. (Nə bilirsiniz) Əbu Zər'inin anası kimdir?! Onun bazar zənbilləri həmişə dolu olur, evi də olduqca genişdir. Əbu Zər'inin oğlu. (Nə bilirsiniz) Əbu Zər'inin oğlu kimdir?! Onun yatağı xurma çubuğuna bənzəyir, özü də dörd aylıq çəpişin ayağını yesə doyar.[3] Əbu Zər'inin qızı. (Nə bilirsiniz) Əbu Zər'inin qızı kimdir?! O, ata-anasının qayğısına qalan toppuş bir qızdır. Onun (gözəlliyi) günüsünü[4] qəzəbləndirir. Əbu Zər'inin kənizi. (Nə bilirsiniz) Əbu Zər'inin kənizi kimdir?! Bu kəniz bizim söhbətlərimizi orda-burda danışmaz, yeməyimizi israf etməz, evimizi də həmişə təmiz və səliqəli saxlar. (Bir dəfə axşamüstü) artıq heyvanlar sağıldıqdan sonra Əbu Zər'i (evdən) bayıra çıxdı və yanında bəbir kimi iki uşağı olan bir qadına rast gəldi. Uşaqlar (əllərini) onun belinin altından salıb iki narla[5] oynayırdılar. Əbu Zər'i məni boşayıb onunla evləndi. Mən də ondan (boşandıqdan) sonra alicənab bir adama, yorulmaq bilməyən gözoxşayan bir at minən, əlində də nizə gəzdirən birisinə ərə getdim. O mənə çoxlu var-dövlət bəxş etdi, (ev) heyvanlarının hər növündən mənə bir cüt verdi və dedi: "Özün də ye, qohumlarına da ver, ey Ummu Zər'i!" (Buna baxmayaraq) əgər mən onun verdiklərinin hamısını bir yerə yığsaydım, (bu əşyalar) Əbu Zər'inin ən balaca qabı qədər olmazdı."

Aişə demişdir: "Peyğəmbər ﷺ (mənə) dedi: "Əbu Zər'i Ummu Zər'ə əziz olduğu kimi, mən də sənə əzizəm." (əl-Buxari, 5189)

## 26-cı fəsil. Qadın ərinin izni olmadan onun evinə heç kəsi buraxmamalıdır

## ٢٦- باب: لاَ تَأْذَنِ الْمَرْأَةُ فِي بَيْتِ زَوْجِهَا لأَحَدٍ إِلاَّ بِإِذْنِهِ

١٨٥٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ لاَ يَحِلُّ لِلْمَرْأَةِ أَنْ تَصُومَ وَزَوْجُهَا شَاهِدٌ إِلاَّ بِإِذْنِهِ وَلاَ تَأْذَنَ فِي بَيْتِهِ إِلاَّ بِإِذْنِهِ وَمَا أَنْفَقَتْ مِنْ نَفَقَةٍ عَنْ غَيْرِ أَمْرِهِ فَإِنَّهُ يُؤَدَّى إِلَيْهِ شَطْرُهُ. [رواه البخاري: ٥١٩٥]

[1] Malik bu dəvələri ağıllarda saxlayardı ki, gələn qonaq-qaravaşa onların südündən və ətindən verə bilsin.

[2] Belə ki, ərəblər qonağı qarşıladıqda ud çalar, dəvələr də kəsiləcəklərini hiss edərdilər.

[3] Qadın bununla oğlanın olduqca nərmənazik olduğunu bildirmişdir.

[4] Yəni ərinin digər zövcələrini özündən çıxardır.

[5] Qadının yanları yekə olduğundan o yerə uzandıqda beli yuxarı qalxmış və uşaqlar əllərindəki narları onun belinin altından o tərəf-bu tərəfə diyirləyirlərmiş. "Fəthul-Bari", 9/273.

**1852.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Heç bir) qadına əri yanında olduğu halda onun izni olmadan oruc tutmaq halal sayılmaz, üstəlik ərinin izni olmadan onun evinə heç kəsi buraxmamalıdır. Qadının ərindən xəbərsiz (Allah yolunda) xərclədiklərinə görə (qazandığı) savabın yarısı ərinə çatır." (əl-Buxari, 5195)

## 27-ci fəsil

## ٢٧– باب

**١٨٥٣** – عَنْ أُسَامَةَ رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ قَالَ قُمْتُ عَلَى بَابِ الْجَنَّةِ فَكَانَ عَامَّةَ مَنْ دَخَلَهَا الْمَسَاكِينُ وَأَصْحَابُ الْجَدِّ مَحْبُوسُونَ غَيْرَ أَنَّ أَصْحَابَ النَّارِ قَدْ أُمِرَ بِهِمْ إِلَى النَّارِ وَقُمْتُ عَلَى بَابِ النَّارِ فَإِذَا عَامَّةُ مَنْ دَخَلَهَا النِّسَاءُ. [رواه البخاري: ٥١٩٦]

**1853.** Usamə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Bir dəfə) mən Cənnətin qapısında durdum. Ora daxil olanların əksəriyyəti kasıblar idi. Varlılar isə (sorğu-sualları qurtaranadək və) Cəhənnəm əhli atəşə giriftar olanadək ləngidilər. Sonra mən Cəhənnəmin qapısında durdum və ora girənlərin çoxunun qadınlar olduğunu gördüm." (əl-Buxari, 5196)

## 28-ci fəsil. Səfərə çıxdıqda qadınlar arasında püşk atmaq[1]

## ٢٨– باب: الْقُرْعَةُ بَيْنَ النِّسَاءِ إِذَا أَرَادَ سَفَرًا

**١٨٥٤** – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا خَرَجَ أَقْرَعَ بَيْنَ نِسَائِهِ فَطَارَتْ الْقُرْعَةُ لِعَائِشَةَ وَحَفْصَةَ وَكَانَ النَّبِيُّ ﷺ إِذَا كَانَ بِاللَّيْلِ سَارَ مَعَ عَائِشَةَ يَتَحَدَّثُ فَقَالَتْ حَفْصَةُ أَلاَ تَرْكَبِينَ اللَّيْلَةَ بَعِيرِي وَأَرْكَبُ بَعِيرَكِ تَنْظُرِينَ وَأَنْظُرُ فَقَالَتْ بَلَى فَرَكِبَتْ فَجَاءَ النَّبِيُّ ﷺ إِلَى جَمَلِ عَائِشَةَ وَعَلَيْهِ حَفْصَةُ فَسَلَّمَ عَلَيْهَا ثُمَّ سَارَ حَتَّى نَزَلُوا وَافْتَقَدَتْهُ عَائِشَةُ فَلَمَّا نَزَلُوا جَعَلَتْ رِجْلَيْهَا بَيْنَ الإِذْخِرِ وَتَقُولُ يَا رَبِّ سَلِّطْ عَلَيَّ عَقْرَبًا أَوْ حَيَّةً تَلْدَغُنِي وَلاَ أَسْتَطِيعُ أَنْ أَقُولَ لَهُ شَيْئًا. [رواه البخاري: ٥٢١١]

**1854.** Aişədən ﷺ rəvayət edilir ki, Peyğəmbər ﷺ (səfərə) çıxdığı zaman zövcələri arasında püşk atardı (və püşk kimə düşsəydi, onu özü ilə səfərə aparardı. Bir dəfə yenə püşk atdı və) püşk Aişə ilə Həfsəyə düşdü. (Səfər əsnasında) gecələr Peyğəmbər ﷺ Aişənin yanında gedir və onunla söhbət edirdi. Bir dəfə Həfsə Aişəyə dedi: "Bəlkə bu gecə sən mənim dəvəmə minəsən, mən də sənin dəvənə minim və baxaq görək nə baş verəcək." Aişə: "Yaxşı"- dedi və (Həfsənin dəvəsinə) mindi. Sonra Peyğəmbər ﷺ Aişənin dəvəsinin yanına gəlib onun üstündə oturan Həfsəyə salam verdi və yoluna davam etdi. Nəhayət, (gəlib bir yerdə) dayandılar. Bu əsnada Aişə Peyğəmbəri ﷺ itirdi. Onlar dincəlmək üçün dayandıqda Aişə (dəvəsindən yerə düşdü) və ayaqlarını ətirli qamışların arasına soxub dedi: "Ya Rəbb, əqrəb və ya ilan vursun məni, axı mən ona cavab verə bilməyəcəyəm." (əl-Buxari, 5211)

[1] 1162-ci hədisə bax.

### ٢٩- باب: إِذَا تَزَوَّجَ الثَّيِّبَ عَلَى الْبِكْرِ

### 29-cu fəsil. Bakirə qızla evli ola-ola dul qadınla evlənmək haqqında

١٨٥٥ – عَنْ أَنَسٍ ﷺ قَالَ: مِنَ السُّنَّةِ إِذَا تَزَوَّجَ الرَّجُلُ الْبِكْرَ عَلَى الثَّيِّبِ أَقَامَ عِنْدَهَا سَبْعًا وَقَسَمَ وَإِذَا تَزَوَّجَ الثَّيِّبَ عَلَى الْبِكْرِ أَقَامَ عِنْدَهَا ثَلاَثًا ثُمَّ قَسَمَ. [رواه البخاري: ٥٢١٣]

**1855.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Kişi dul qadınla evli olduğu halda bakirə qızla evlənərsə, yeddi gün (ardıcıl olaraq) onun yanında qalmalı, sonra isə günləri onların arasında bölüşdürməlidir. Və əgər bakirə qızla evli olduğu halda dul qadınla evlənərsə, üç gün (ardıcıl olaraq) onun yanında qalmalı, sonra isə günləri onların arasında bölüşdürməlidir." (əl-Buxari, 5213)

### ٣٠- باب: الْمُتَشَبِّعُ بِمَا لَمْ يَنَلْ وَمَا يُنْهَى مِنْ افْتِخَارِ الضَّرَّةِ

### 30-cu fəsil. (Birisinin) nail olmadığı bir şeyi əldə etdiyini elan etməsi, habelə zövcələrdən birinin digəri yanında qürrələnməsi

١٨٥٦ – عَنْ أَسْمَاءَ ﷺ أَنَّ امْرَأَةً قَالَتْ يَا رَسُولَ اللَّهِ إِنَّ لِي ضَرَّةً فَهَلْ عَلَيَّ جُنَاحٌ إِنْ تَشَبَّعْتُ مِنْ زَوْجِي غَيْرَ الَّذِي يُعْطِينِي فَقَالَ رَسُولُ اللَّهِ ﷺ الْمُتَشَبِّعُ بِمَا لَمْ يُعْطَ كَلاَبِسِ ثَوْبَيْ زُورٍ. [رواه البخاري: ٥٢١٩]

**1856.** Əsma ﷺ rəvayət edir ki, (bir dəfə) biq qadın (Peyğəmbərə ﷺ) dedi: "Ya Rəsulullah, mənim günüm[1] vardır. Əgər mən ərimin mənə vermədiyi bir şeyi (guya) mənə verdiyini danışsam günah qazanarammı?" Peyğəmbər ﷺ buyurdu: "Əslində, əldə etmədiyi bir şeyi əldə etdiyini bildirən kimsə iki ədəd böhtan libası[2] geymiş adama bənzəyir." (əl-Buxari, 5219)

### ٣١- باب: الْغَيْرَةُ

### 31-ci fəsil. Qısqanclıq

١٨٥٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ إِنَّ اللَّهَ يَغَارُ وَغَيْرَةُ اللَّهِ أَنْ يَأْتِيَ الْمُؤْمِنُ مَا حَرَّمَ اللَّهُ. [رواه البخاري: ٥٢٢٣]

**1857.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həqiqətən, Allah qısqancdır. Mömin Allahın haram buyurduğunu etdikdə Allah onu qısqanır." (əl-Buxari, 5223)

١٨٥٨ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ﷺ قَالَتْ: تَزَوَّجَنِي الزُّبَيْرُ وَمَا لَهُ فِي الأَرْضِ مِنْ مَالٍ وَلاَ مَمْلُوكٍ وَلاَ شَيْءٍ غَيْرَ نَاضِحٍ وَغَيْرَ فَرَسِهِ فَكُنْتُ أَعْلِفُ فَرَسَهُ وَأَسْتَقِي الْمَاءَ وَأَخْرِزُ غَرْبَهُ وَأَعْجِنُ وَلَمْ أَكُنْ أُحْسِنُ أَخْبِزُ وَكَانَ يَخْبِزُ جَارَاتٌ لِي مِنَ الأَنْصَارِ وَكُنَّ نِسْوَةَ صِدْقٍ وَكُنْتُ أَنْقُلُ النَّوَى مِنْ أَرْضِ الزُّبَيْرِ الَّتِي أَقْطَعَهُ رَسُولُ اللَّهِ ﷺ

---

[1] Günü: birinci arvadın üstünə alınan ikinci, üçüncü və ya dördüncü arvad.

[2] Birisi bir başqasından borca iki qiymətli paltar alıb geyir ki, zahiri görünüşü ilə insanları aldadıb onları inandıra bilsin.

عَلَى رَأْسِي وَهِيَ مِنِّي عَلَى ثُلُثَيْ فَرْسَخٍ فَجِئْتُ يَوْمًا وَالنَّوَى عَلَى رَأْسِي فَلَقِيتُ رَسُولَ اللَّهِ ﷺ وَمَعَهُ نَفَرٌ مِنْ الأَنْصَارِ فَدَعَانِي ثُمَّ قَالَ إِخْ إِخْ لِيَحْمِلَنِي خَلْفَهُ فَاسْتَحْيَيْتُ أَنْ أَسِيرَ مَعَ الرِّجَالِ وَذَكَرْتُ الزُّبَيْرَ وَغَيْرَتَهُ وَكَانَ أَغْيَرَ النَّاسِ فَعَرَفَ رَسُولُ اللَّهِ ﷺ أَنِّي قَدْ اسْتَحْيَيْتُ فَمَضَى فَجِئْتُ الزُّبَيْرَ فَقُلْتُ لَقِيَنِي رَسُولُ اللَّهِ ﷺ وَعَلَى رَأْسِي النَّوَى وَمَعَهُ نَفَرٌ مِنْ أَصْحَابِهِ فَأَنَاخَ لأَرْكَبَ فَاسْتَحْيَيْتُ مِنْهُ وَعَرَفْتُ غَيْرَتَكَ فَقَالَ وَاللَّهِ لَحَمْلُكِ النَّوَى كَانَ أَشَدَّ عَلَيَّ مِنْ رُكُوبِكِ مَعَهُ قَالَتْ حَتَّى أَرْسَلَ إِلَيَّ أَبُو بَكْرٍ بَعْدَ ذَلِكَ بِخَادِمٍ تَكْفِينِي سِيَاسَةَ الْفَرَسِ فَكَأَنَّمَا أَعْتَقَنِي. [رواه البخاري: ٥٢٢٤]

**1858.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr ؓ demişdir: "Zubeyr mənimlə evlənərkən yer üzündə onun, – dəvəsi və atı istisna olmaqla, – nə bir malı, nə bir köləsi, nə də başqa bir şeyi var idi. (Ər evində) mən onun atını yemləyir, (quyudan) su çıxardır, dəridən olan su tuluğunu tikir və xəmir yoğururdum. Mən çörəyi yaxşı bişirə bilmirdim (deyə) qonşuluqda yaşayan ənsar qadınları mənə bu işdə köməklik edirdilər. Onlar ləyaqətli qadınlar idilər. Mən Peyğəmbərin ﷺ Zubeyr üçün ayırdığı torpaq sahəsindəki xurma çəyirdəklərini (zənbilə yığıb) başımın üstündə (evə) aparardım. Bu xurmalıq bizim evdən üçdə iki fərsəx[1] aralıda yerləşirdi. Bir gün mən yenə başımın üstündə xurma çəyirdəyi apararkən Peyğəmbərə ﷺ rast gəldim. Yanında ənsardan bir dəstə adam var idi. O məni yanına çağırdı və (dəvəsinə) "İx, ix![2]"– dedi ki, (onu yerə çökdürüb) məni tərkinə alsın. Mən kişilərlə birgə getməkdən həya elədim, Zubeyri və onun qısqanc olduğunu xatırladım. Zubeyr çox qısqanc adam idi. Peyğəmbər ﷺ mənim utandığımı başa düşüb yoluna davam etdi. Sonra mən Zubeyrin yanına gəlib dedim: "Mən başımda xurma çəyirdəyi daşıyarkən Peyğəmbərə ﷺ rast gəldim. Yanında da əshabələrindən bir dəstə adam var idi. O, dəvəsini yerə çökdürdü ki, məni tərkinə alsın, lakin mən ondan utandım və sənin qısqanclığın yadıma düşdü. Zubeyr dedi: "Vallahi ki, sənin xurma çəyirdəyi daşımağın mənim üçün onun tərkinə minməyindən daha ağır gəlir." Nəhayət, Əbu Bəkr mənim yanıma bir xidmətçi göndərdi ki, atlara baxsın və (beləliklə də) sanki məni (bu yükdən) azad etdi." (əl-Buxari, 5224)

## 32-ci fəsil. Qadınların qısqanclığı və qəzəbi

## ٣٢– باب: غَيْرَةُ النِّسَاءِ وَوَجْدُهُنَّ

١٨٥٩ – عَنْ عَائِشَةَ ؓ قَالَتْ: قَالَ لِي رَسُولُ اللَّهِ ﷺ إِنِّي لأَعْلَمُ إِذَا كُنْتِ عَنِّي رَاضِيَةً وَإِذَا كُنْتِ عَلَيَّ غَضْبَى قَالَتْ فَقُلْتُ مِنْ أَيْنَ تَعْرِفُ ذَلِكَ فَقَالَ أَمَّا إِذَا كُنْتِ عَنِّي رَاضِيَةً فَإِنَّكِ تَقُولِينَ لاَ وَرَبِّ مُحَمَّدٍ وَإِذَا كُنْتِ عَلَيَّ غَضْبَى قُلْتِ لاَ وَرَبِّ إِبْرَاهِيمَ قَالَتْ قُلْتُ أَجَلْ وَاللَّهِ يَا رَسُولَ اللَّهِ مَا أَهْجُرُ إِلاَّ اسْمَكَ. [رواه البخاري: ٥٢٢٨]

**1859.** Rəvayət edilir ki, Aişə ؓ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ mənə dedi: "Mən sənin (nə vaxt) mənə qəzəbləndiyini və (nə vaxt) məndən razı qaldığını bilirəm." Mən soruşdum: "Bunu nədən bilirsən?" Dedi: "Sən məndən razı

[1] Bir fərsəx 5760 metrə bərabərdir.
[2] Bu kəlməni ərəblər dəvəni yerə çökdürmək üçün ifadə edirlər.

qaldıqda deyirsən ki: "Bəli, Muhəmmədin Rəbbinə and olsun!" Mənə qəzəbin tutduqda isə deyirsən ki: "Xeyr, İbrahimin Rəbbinə and olsun!" Mən dedim: "Elədir! Vallahi, ya Rəsulullah, mən (qəzəbləndikdə) sadəcə sənin adını çəkmirəm." (əl-Buxari, 5228)

## ٣٣- باب: لاَ يَخْلُوَنَّ رَجُلٌ بِامْرَأَةٍ إِلاَّ ذُو مَحْرَمٍ وَالدُّخُولُ عَلَى الْمُغِيبَةِ

## 33-cü fəsil. Kişi məhrəmi sayıldığı qadınlardan başqa heç bir qadınla xəlvətdə qala bilməz, habelə əri evdə olmayan qadının evinə daxil ola bilməz

١٨٦٠ – عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ إِيَّاكُمْ وَالدُّخُولَ عَلَى النِّسَاءِ فَقَالَ رَجُلٌ مِنَ الأَنْصَارِ يَا رَسُولَ اللَّهِ أَفَرَأَيْتَ الْحَمْوَ قَالَ الْحَمْوُ الْمَوْتُ. [رواه البخاري: ٥٢٣٢]

**1860.** Uqbə ibn Amir ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ buyurdu: "Nəbadə qadınların yanına girəsiniz!" Ənsardan biri dedi: "Ya Rəsulullah, qayın[1] barədə nə deyə bilərsən?" Peyğəmbər ﷺ buyurdu: "Qayın ölümdür". (əl-Buxari, 5232)

## ٣٤- باب: لاَ تُبَاشِرْ الْمَرْأَةُ الْمَرْأَةَ فَتَنْعَتَهَا لِزَوْجِهَا

## 34-cü fəsil. Bir qadın başqa bir qadını ərinə vəsf etmək məqsədilə həmin qadına toxunmamalıdır

١٨٦١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ لاَ تُبَاشِرُ الْمَرْأَةُ الْمَرْأَةَ فَتَنْعَتَهَا لِزَوْجِهَا كَأَنَّهُ يَنْظُرُ إِلَيْهَا. [رواه البخاري: ٥٢٤٠]

**1861.** Abdullah ibn Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir qadın başqa bir qadına toxunub sonra onu ərinə vəsf etməsin. (Çünki belə etsə) əri o qadını (xəyalında) canlandırmağa çalışacaq." (əl-Buxari, 5240)

## ٣٥- باب: لاَ يَطْرُقْ أَهْلَهُ لَيْلاً إِذَا أَطَالَ الْغَيْبَةَ مَخَافَةَ أَنْ يُخَوِّنَهُمْ أَوْ يَلْتَمِسَ عَثَرَاتِهِمْ

## 35-ci fəsil. Uzunmüddətli səfərdən gecə ikən evinə qayıdan adam ailəsinin qapısını döyməməlidir ki, bu, qadının sədaqətinin yoxlanılması və ya onda hansısa bir nöqsan axtarılması kimi başa düşülməsin

[1] Burada qayın deyildikdə ümumiyyətlə kişi tərəfin qohumları nəzərdə tutulur.

١٨٦٢ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ إِذَا أَطَالَ أَحَدُكُمْ الْغَيْبَةَ فَلاَ يَطْرُقْ أَهْلَهُ لَيْلاً. [رواه البخاري: ٥٢٤٤]

**1862.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz uzunmüddətli səfərdən gecə ikən evinə qayıdarsa, ailəsinin qapısını döyməsin." (əl-Buxari, 5244)

١٨٦٣ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ قَالَ: إِذَا دَخَلْتَ لَيْلاً فَلاَ تَدْخُلْ عَلَى أَهْلِكَ حَتَّى تَسْتَحِدَّ الْمُغِيبَةُ وَتَمْتَشِطَ الشَّعِثَةُ. [رواه البخاري: ٥٢٤٧]

**1863.** Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Gecə vaxtı (səfərdən) qayıtdığın zaman övrətin qasığının tüklərini təmizləməyincə və saçlarını sahmana salmayınca onun yanına daxil olmamalısan!" (əl-Buxari, 5247)

# ٦٨ – كِتَابُ الطَّلَاقِ

# 68 – Talaq kitabı

## ١ – باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿يَٰٓأَيُّهَا ٱلنَّبِيُّ إِذَا طَلَّقۡتُمُ ٱلنِّسَآءَ فَطَلِّقُوهُنَّ لِعِدَّتِهِنَّ وَأَحۡصُواْ ٱلۡعِدَّةَ﴾

## 1-ci fəsil. Uca Allahın: "Ey Peyğəmbər! Qadınları boşadığınız zaman onları gözləmə müddətlərində boşayın, gözləmə müddətini hesablayın"[1] sözü

١٨٦٤ – عَنْ عَبْد اللَّه بْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ طَلَّقَ امْرَأَتَهُ وَهِيَ حَائِضٌ عَلَى عَهْد رَسُول اللَّه ﷺ فَسَأَلَ عُمَرُ بْنُ الْخَطَّاب رَسُولَ اللَّه ﷺ عَنْ ذَلكَ فَقَالَ رَسُولُ اللَّه ﷺ مُرْهُ فَلْيُرَاجعْهَا ثُمَّ لِيُمْسكْهَا حَتَّى تَطْهُرَ ثُمَّ تَحيضَ ثُمَّ تَطْهُرَ ثُمَّ إنْ شَاءَ أَمْسَكَ بَعْدُ وَإنْ شَاءَ طَلَّقَ قَبْلَ أَنْ يَمَسَّ فَتلْكَ الْعدَّةُ الَّتي أَمَرَ اللَّهُ أَنْ تُطَلَّقَ لَهَا النِّسَاءُ. [رواه البخاري: ٥٢٥١]

**1864.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما Peyğəmbərin ﷺ dövründə öz zövcəsi heyzli ikən onu boşamışdı. Ömər ibn Xəttab رضي الله عنه bu haqda Peyğəmbərdən ﷺ soruşdu və Peyğəmbər ﷺ ona belə buyurdu: "Ona əmr et, qadını geri qaytarsın. Sonra o (heyzdən) təmizlənənədək, bir daha heyz olub yenə təmizlənənədək gözləsin. Bundan sonra (onu saxlamaq) istəsə, saxlasın, (boşamaq) istəsə, onunla yaxınlıq etməmişdən əvvəl onu boşasın. Bu, qadınları boşamaq üçün Allahın buyurduğu gözləmə müddətidir." (əl-Buxari, 5251)

## ٢ – باب: إِذَا طُلِّقَتْ الْحَائِضُ تَعْتَدُّ بِذَلكَ الطَّلَاقِ

## 2-ci fəsil. Qadın heyz gördükdə ona talaq verilərsə, bu talaq keçərli sayılar

١٨٦٥ – عَنْهُ رضي الله عنهما قَالَ: حُسِبَتْ عَلَيَّ بِتَطْلِيقَةٍ. [رواه البخاري: ٥٢٥٣]

**1865.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "(Mən zövcəmə talaq verdikdən sonra) o (bir dəfə) boşanmış sayıldı.[2]" (əl-Buxari, 5253)

## ٣ – باب: مَنْ طَلَّقَ وَهَلْ يُوَاجِهُ الرَّجُلُ امْرَأَتَهُ بِالطَّلَاقِ

## 3-cü fəsil. (Zövcəsini) boşayan kimsə haqqında, bir də ki qadını boşayan kişi bunu ona özü bildirməlidirmi?

١٨٦٦ – عَنْ عَائشَةَ رضي الله عنها أَنَّ ابْنَةَ الْجَوْن لَمَّا أُدْخلَتْ عَلَى رَسُول اللَّه ﷺ وَدَنَا منْهَا قَالَتْ أَعُوذُ باللَّه منْكَ فَقَالَ لَهَا لَقَدْ عُذْت بعَظيمٍ الْحَقي بأَهْلك. [رواه البخاري: ٥٢٥٤]

---

[1] "ət-Talaq" surəsi, 1. Ayənin tamamı: **"...və Rəbbiniz olan Allahdan qorxun. Onları, açıq-aşkar zinakarlıq etmələri istisna olmaqla, öz evlərinizdən qovub çıxartmayın və onlar özləri də çıxmasınlar. Bu, Allahın hüdudlarıdır. Allahın qoyduğu hüdudları aşan kimsə özünə zülm etmiş olar. Sən bilmirsən, ola bilsin ki, Allah bundan sonra *başqa* bir hökm versin."**

[2] Yəni, əgər onu geri qaytarsaydı, bundan başqa hələ iki dəfə də boşaya bilərdi.

**1866.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Cövnün qızı Peyğəmbərin ﷺ evinə gəlin gətirildiyi və Peyğəmbər ﷺ ona yaxınlaşdığı zaman qız: “Mən səndən Allaha sığınıram!”– dedi. Onda Peyğəmbər ﷺ ona dedi: “Sən Əzəmətli (Allaha) sığındın. Elə isə get ailənin yanına.[1]” (əl-Buxari, 5254)

١٨٦٧ – عَنْ أَبِي أُسَيْدٍ ﵁ قَالَ: خَرَجْنَا مَعَ النَّبِيِّ ﷺ حَتَّى انْطَلَقْنَا إِلَى حَائِطٍ يُقَالُ لَهُ الشَّوْطُ حَتَّى انْتَهَيْنَا إِلَى حَائِطَيْنِ فَجَلَسْنَا بَيْنَهُمَا فَقَالَ النَّبِيُّ ﷺ اجْلِسُوا هَا هُنَا وَدَخَلَ وَقَدْ أُتِيَ بِالْجَوْنِيَّةِ فَأُنْزِلَتْ فِي بَيْتٍ فِي نَخْلٍ فِي بَيْتِ أُمَيْمَةَ بِنْتِ النُّعْمَانِ بْنِ شَرَاحِيلَ وَمَعَهَا دَايَتُهَا حَاضِنَةٌ لَهَا فَلَمَّا دَخَلَ عَلَيْهَا النَّبِيُّ ﷺ قَالَ هَبِي نَفْسَكِ لِي قَالَتْ وَهَلْ تَهَبُ الْمَلِكَةُ نَفْسَهَا لِلسُّوقَةِ قَالَ فَأَهْوَى بِيَدِهِ يَضَعُ يَدَهُ عَلَيْهَا لِتَسْكُنَ فَقَالَتْ أَعُوذُ بِاللَّهِ مِنْكَ فَقَالَ قَدْ عُذْتِ بِمَعَاذٍ ثُمَّ خَرَجَ عَلَيْنَا فَقَالَ يَا أَبَا أُسَيْدٍ اكْسُهَا رَازِقِيَّتَيْنِ وَأَلْحِقْهَا بِأَهْلِهَا. [رواه البخاري: ٥٢٥٥]

**1867.** Rəvayət edilir ki, Əbu Useyd ﵁ demişdir: “(Bir dəfə) biz Peyğəmbərlə ﷺ birlikdə Şovt adlanan bağa getdik. Nəhayət, gəlib iki bağa çatdıq və onların arasında oturduq. Peyğəmbər ﷺ (bizə): “Siz burada oturun”- dedi, özü isə bağa girdi. Bu vaxt Cövn qızlarından birini gətirib həmin xurma bağında yerləşən bir evə – Umeyyə bint Nomən ibn Şərahilin evinə – daxil etdilər. Körpəlikdən ona baxan dayəsi də yanında idi. Peyğəmbər ﷺ onun yanına girib: “Nəfsini mənə bağışla”– dedi. Qız (Peyğəmbəri ﷺ tanımadığından) cavabında ona belə dedi: “Deyirsən məlikə öz nəfsini çobana bağışlasın?” Peyğəmbər ﷺ əlini qıza uzatdı ki, onu sakitləşdirsin, lakin qız: “Mən səndən Allaha sığınıram!”– dedi. Onda Peyğəmbər ﷺ buyurdu: “Artıq sən sığınacaq verən Allaha sığındın!” Sonra Peyğəmbər ﷺ bizim yanımıza gəlib dedi: “Ey Əbu Useyd, bu qıza iki ağ paltar ver və onu ailəsinin yanına göndər!” (əl-Buxari, 5255)

## 4-cü fəsil. Üç dəfə talaq verməyi caiz sayan kimsə haqqında

## ٤ – باب: مَنْ أَجَازَ طَلاَقَ الثَّلاَثِ

١٨٦٨ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: أَنَّ امْرَأَةَ رِفَاعَةَ الْقُرَظِيِّ جَاءَتْ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَتْ يَا رَسُولَ اللَّهِ إِنَّ رِفَاعَةَ طَلَّقَنِي فَبَتَّ طَلاَقِي وَإِنِّي نَكَحْتُ بَعْدَهُ عَبْدَ الرَّحْمَنِ بْنَ الزُّبَيْرِ الْقُرَظِيَّ وَإِنَّمَا مَعَهُ مِثْلُ الْهُدْبَةِ قَالَ رَسُولُ اللَّهِ ﷺ لَعَلَّكِ تُرِيدِينَ أَنْ تَرْجِعِي إِلَى رِفَاعَةَ لاَ حَتَّى يَذُوقَ عُسَيْلَتَكِ وَتَذُوقِي عُسَيْلَتَهُ. [رواه البخاري: ٥٢٦٠]

**1868.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “(Bir dəfə) Rifaə əl-Qurəzinin arvadı Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah, Rifaə məni boşadıqdan və mənim iddəm bitdikdən sonra mən Abdur-Rəhman ibn Zubeyr əl-Qurəziyə ərə getdim. Lakin (bir kişi kimi) o məni qane etmir.” Peyğəmbər ﷺ dedi: “Olmaya, sən Rifaəyə qayıtmaq istəyirsən?! Yox, sən Abdur-Rəhmanla yaxınlıq etməyincə (Rifaəyə) qayıda bilməzsən.” (əl-Buxari, 5260)

[1] Bu söz Peyğəmbərin onu boşadığına işarə idi.

## ٥- باب: ﴿لِمَ تُحَرِّمُ مَآ أَحَلَّ ٱللَّهُ لَكَ﴾

## 5-ci fəsil. "Allahın sənə halal etdiyi şeyi nə üçün özünə qadağan edirsən?"[1]

١٨٦٩ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يُحِبُّ الْعَسَلَ وَالْحَلْوَاءَ وَكَانَ إِذَا انْصَرَفَ مِنَ الْعَصْرِ دَخَلَ عَلَى نِسَائِهِ فَيَدْنُو مِنْ إِحْدَاهُنَّ فَدَخَلَ عَلَى حَفْصَةَ بِنْتِ عُمَرَ فَاحْتَبَسَ أَكْثَرَ مَا كَانَ يَحْتَبِسُ فَغِرْتُ فَسَأَلْتُ عَنْ ذَلِكَ فَقِيلَ لِي أَهْدَتْ لَهَا امْرَأَةٌ مِنْ قَوْمِهَا عُكَّةً مِنْ عَسَلٍ فَسَقَتِ النَّبِيَّ ﷺ مِنْهُ شَرْبَةً فَقُلْتُ أَمَا وَاللَّهِ لَنَحْتَالَنَّ لَهُ فَقُلْتُ لِسَوْدَةَ بِنْتِ زَمْعَةَ إِنَّهُ سَيَدْنُو مِنْكِ فَإِذَا دَنَا مِنْكِ فَقُولِي أَكَلْتَ مَغَافِيرَ فَإِنَّهُ سَيَقُولُ لَكِ لاَ فَقُولِي لَهُ مَا هَذِهِ الرِّيحُ الَّتِي أَجِدُ مِنْكَ فَإِنَّهُ سَيَقُولُ لَكِ سَقَتْنِي حَفْصَةُ شَرْبَةَ عَسَلٍ فَقُولِي لَهُ جَرَسَتْ نَحْلُهُ الْعُرْفُطَ وَسَأَقُولُ ذَلِكِ وَقُولِي أَنْتِ يَا صَفِيَّةُ ذَاكِ قَالَتْ تَقُولُ سَوْدَةُ فَوَاللَّهِ مَا هُوَ إِلاَّ أَنْ قَامَ عَلَى الْبَابِ فَأَرَدْتُ أَنْ أُبَادِيَهُ بِمَا أَمَرْتِنِي بِهِ فَرَقًا مِنْكِ فَلَمَّا دَنَا مِنْهَا قَالَتْ لَهُ سَوْدَةُ يَا رَسُولَ اللَّهِ أَكَلْتَ مَغَافِيرَ قَالَ لاَ قَالَتْ فَمَا هَذِهِ الرِّيحُ الَّتِي أَجِدُ مِنْكَ قَالَ سَقَتْنِي حَفْصَةُ شَرْبَةَ عَسَلٍ فَقَالَتْ جَرَسَتْ نَحْلُهُ الْعُرْفُطَ فَلَمَّا دَارَ إِلَيَّ قُلْتُ لَهُ نَحْوَ ذَلِكَ فَلَمَّا دَارَ إِلَى صَفِيَّةَ قَالَتْ لَهُ مِثْلَ ذَلِكَ فَلَمَّا دَارَ إِلَى حَفْصَةَ قَالَتْ يَا رَسُولَ اللَّهِ أَلاَ أَسْقِيكَ مِنْهُ قَالَ لاَ حَاجَةَ لِي فِيهِ قَالَتْ تَقُولُ سَوْدَةُ وَاللَّهِ لَقَدْ حَرَمْنَاهُ قُلْتُ لَهَا اسْكُتِي. [رواه البخاري: ٥٢٦٨]

**1869.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər bal və (digər) şirniyyatları xoşlayardı. O (hər gün) əsrdən sonra zövcələrinə baş çəkər (və onlardan hər birinin yanında) bir qədər oturardı. (Bir gün) o, Həfsə bint Ömərin yanına gəldi və həmişəkindən fərqli olaraq bir az yubandı. Mən onu qısqandım və onun yubanmağının səbəbini soruşdum. Mənə dedilər ki: "Həmqəbilələrindən olan bir qadın (Həfsəyə) bal bağışlamış, o da bu baldan Peyğəmbərə ﷺ içirtmişdir." Mən dedim: "Vallahi, ona kələk qurmaq lazımdır." Sonra Səudə bint Zəmaya müraciət edib dedim: "(Bir azdan) o sənin yanına gələcək. O sənə yaxınlaşan kimi soruşarsan ki: "Kitrə[2] yemisən?" O sənə: "Xeyr!"– deyə cavab verəcək. Sən ona deyərsən: "Bəs bu nə iydir mənim burnuma gəlir?" O sənə deyəcək: "Həfsə mənə bal içirdib." Onda sən ona deyərsən: "Yəqin ki, arılar bu balı Urfut ağacından çəkdiyi şirədən hasil etmişlər." (Aişə) dedi: "Mən də (ona) belə deyəcəyəm, sən də belə deyərsən, ey Səfiyyə." Səudə dedi: "Vallahi, Peyğəmbər ﷺ qapının ağzına gəlib çatdıqda mən onun qabağına çıxıb sənin buyuruğunu hökmən yerinə yetirəcəyəm." (Aişə) dedi: "Peyğəmbər ﷺ ona yaxınlaşdıqda o, Peyğəmbərə ﷺ dedi: "Ya Rəsulullah, kitrə yemisən?" O: "Xeyr!"– deyə cavab verdi. Səudə soruşdu: "Bəs bu nə iydir mənim burnuma gəlir?" Peyğəmbər ﷺ dedi: "Həfsə mənə bal içirdib." Səudə dedi: "Yəqin ki, arılar bu balı Urfut ağacından çəkdiyi şirədən hasil etmişlər." Sonra o mənim yanıma gəldi və mən də ona həmin sözləri dedim. Daha sonra o, Səfiyyənin yanına getdi və o da ona həmin sözləri dedi. Nəhayət, o, Həfsənin yanına gəldikdə Həfsə dedi: "Ya Rəsulullah, sənə bal verimmi?" O dedi: "Mənim buna ehtiyacım yoxdur." (Bu vaxt) Səudə: "Vallahi ki, biz onu baldan məhrum edə bildik"– dedi, mən də ona: "Sus!"- dedim." (əl-Buxari, 5268)

[1] "ət-Təhrim" surəsi, 1.

[2] 1785-ci hədisin qeydlərinə bax.

## 6-cı fəsil.
## Xul[1] və bu növ talaq necə yerinə yetirilir? Uca Allah buyurur: “ Onlara verdiklərinizdən bir şey götürmək sizə halal olmaz. Yalnız hər ikisinin Allahın hədlərini yerinə yetirməyəcəklərindən qorxması istisnadır”[2]

## ٦– باب:
## الْخُلْعُ وَكَيْفَ الطَّلاَقُ فِيهِ وَقَوْلُ اللَّهِ تَعَالَى: ﴿وَلَا يَحِلُّ لَكُمْ أَن تَأْخُذُوا۟ مِمَّآ ءَاتَيْتُمُوهُنَّ شَيْـًٔا إِلَّآ أَن يَخَافَآ أَلَّا يُقِيمَا حُدُودَ ٱللَّهِ﴾

١٨٧٠ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ امْرَأَةَ ثَابِت بْنِ قَيْسٍ أَتَتْ النَّبِيَّ ﷺ فَقَالَتْ يَا رَسُولَ اللَّه ثَابِتُ بْنُ قَيْسٍ مَا أَعْتبُ عَلَيْهِ فِي خُلُقٍ وَلاَ دِينٍ وَلَكِنِّي أَكْرَهُ الْكُفْرَ فِي الإِسْلاَمِ فَقَالَ رَسُولُ اللَّه ﷺ أَتَرُدِّينَ عَلَيْهِ حَدِيقَتَهُ قَالَتْ نَعَمْ قَالَ رَسُولُ اللَّهِ ﷺ اقْبَلْ الْحَدِيقَةَ وَطَلِّقْهَا تَطْلِيقَةً. [رواه البخاري: ٥٢٧٥]

**1870.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Sabit ibn Qeysin zövcəsi Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah, Sabit ibn Qeysin nə əxlaqına, nə də dindarlığına heç bir etirazım yoxdur, sadəcə olaraq (o mənim ürəyimə yatmır və mən) istəmirəm ki, müsəlman olduğum halda küfr edəm.[3]” Peyğəmbər ﷺ soruşdu: “Onun (mehr olaraq) verdiyi bağı özünə qaytararsanmı?” Qadın: “Bəli!”– deyə cavab verdi. Onda Peyğəmbər ﷺ (Sabitə) dedi: “Bağı götür və onun birinci talağını ver!” (əl-Buxari, 5275)

## 7-ci fəsil.
## Peyğəmbərin ﷺ Bərirənin ərinə havadarlıq etməsi

## ٧– باب:
## شَفَاعَةُ النَّبِيِّ ﷺ فِي زَوْجِ بَرِيرَةَ

١٨٧١ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ زَوْجَ بَرِيرَةَ كَانَ عَبْدًا يُقَالُ لَهُ مُغِيثٌ كَأَنِّي أَنْظُرُ إِلَيْهِ يَطُوفُ خَلْفَهَا يَبْكِي وَدُمُوعُهُ تَسِيلُ عَلَى لِحْيَتِه فَقَالَ النَّبِيُّ ﷺ لِعَبَّاسٍ يَا عَبَّاسُ أَلاَ تَعْجَبُ مِنْ حُبِّ مُغِيث بَرِيرَةَ وَمِنْ بُغْضِ بَرِيرَةَ مُغِيثًا فَقَالَ النَّبِيُّ ﷺ لَوْ رَاجَعْتِه قَالَتْ يَا رَسُولَ اللَّهِ تَأْمُرُنِي قَالَ إِنَّمَا أَنَا أَشْفَعُ قَالَتْ لاَ حَاجَةَ لِي فِيه. [رواه البخاري: ٥٢٨٣]

**1871.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Bərirənin əri Muğis adlı bir kölə idi. Onun qadının dalınca düşdüyü, göz yaşlarının da axıb saqqalına töküldüyü indi də gözümdə canlanır. Onda Peyğəmbər ﷺ Abbasa dedi: “Ey Abbas, sən Muğisin Bərirəyə aşiq olduğuna, Bərirənin də Muğisə nifrət etdiyinə təəccüb etmirsənmi?” Sonra Peyğəmbər ﷺ (Bərirəyə) dedi: “Bəlkə ona qayıdasan.” (Bərirə) dedi: “Ya Rəsulullah, bu mənə əmrdirmi?” Peyğəmbər ﷺ dedi: “Mən sadəcə (ona) havadarlıq edirəm.” (Bərirə): “Mənim ona ehtiyacım yoxdur”– dedi.” (əl-Buxari, 5283)

---

[1] Qadının tələbilə kişinin onu boşaması və qadına verdiyi mehrin kişiyə qaytarılması.

[2] “əl-Bəqərə” surəsi, 229.

[3] Qadın qorxurdu ki, beləcə, istəməyə-istəməyə onunla yaşamağa davam etsə, bu onu küfrə gətirib çıxaracaq.

## 8-ci fəsil

## ٨– باب

١٨٧٢ – عَنْ سَهْلٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ أَنَا وَكَافِلُ الْيَتِيمِ فِي الْجَنَّةِ هَكَذَا وَأَشَارَ بِالسَّبَّابَةِ وَالْوُسْطَى وَفَرَّجَ بَيْنَهُمَا شَيْئًا. [رواه البخاري: ٥٣٠٤]

**1872.** Səhl ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ orta barmağıyla işarə barmağını yan-yana azacıq aralı tutub demişdir: "Mən və yetimin himayədarı Cənnətdə (bu iki barmaq kimi) olacağıq." (əl-Buxari, 5304)

## 9-cu fəsil. (Kişi) doğulan uşağın ondan olmasını inkar edərsə

## ٩– باب: إِذَا عَرَّضَ بِنَفْيِ الْوَلَدِ

١٨٧٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَجُلاً أَتَى النَّبِيَّ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ وُلِدَ لِي غُلاَمٌ أَسْوَدُ فَقَالَ: هَلْ لَكَ مِنْ إِبِلٍ؟ قَالَ: نَعَمْ قَالَ: مَا أَلْوَانُهَا؟ قَالَ: حُمْرٌ قَالَ: هَلْ فِيهَا مِنْ أَوْرَقَ؟ قَالَ: نَعَمْ قَالَ: فَأَنَّى ذَلِكَ؟ قَالَ: لَعَلَّهُ نَزَعَهُ عِرْقٌ قَالَ: فَلَعَلَّ ابْنَكَ هَذَا نَزَعَهُ عِرْقٌ. [رواه البخاري: ٥٣٠٥]

**1873.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, mənim (özüm də, zövcəm də ağ dərili olduğumuz halda) uşağım qara dərili doğuldu." Peyğəmbər ﷺ soruşdu: "Sənin dəvələrin varmı?" Adam: "Bəli!"– dedi. Peyğəmbər ﷺ soruşdu: "Nə rəngdədir?" (Adam): "Qırmızıdır"- dedi. Peyğəmbər ﷺ soruşdu: "Aralarında boz rəngli olanı varmı?" (Adam): "Bəli"– deyə cavab verdi. Peyğəmbər ﷺ soruşdu: "Hardandır onlar?" (Adam): "Ola bilsin ki, irsən keçmişdir." Peyğəmbər ﷺ dedi: "Ola bilsin ki, sənin uşağına da irsən keçmişdir." (əl-Buxari, 5305)

## 10-cu fəsil. İmamın lənətləşən iki nəfərə: "Heç şübhəsiz ki, sizdən biriniz yalan danışır. Aranızda tövbə etmək istəyən yoxdurmu?" deməsi

## ١٠– باب: قَوْلُ الإِمَامِ لِلْمُتَلاَعِنَيْنِ إِنَّ أَحَدَكُمَا كَاذِبٌ فَهَلْ مِنْكُمَا تَائِبٌ

١٨٧٤ – عَنْ ابْنَ عُمَرَ ﷺ فِي حَدِيثِ الْمُتَلاَعِنَيْنِ قَالَ: قَالَ النَّبِيُّ ﷺ لِلْمُتَلاَعِنَيْنِ حِسَابُكُمَا عَلَى اللَّهِ أَحَدُكُمَا كَاذِبٌ لاَ سَبِيلَ لَكَ عَلَيْهَا قَالَ مَالِي قَالَ لاَ مَالَ لَكَ إِنْ كُنْتَ صَدَقْتَ عَلَيْهَا فَهُوَ بِمَا اسْتَحْلَلْتَ مِنْ فَرْجِهَا وَإِنْ كُنْتَ كَذَبْتَ عَلَيْهَا فَذَاكَ أَبْعَدُ لَكَ. [رواه البخاري: ٥٣١٢]

**1874.** İbn Ömər ﷺ öz aralarında lənətləşən ər-arvadın əhvalatını rəvayət edərkən demişdir: "Peyğəmbər ﷺ lənətləşən bu ər-arvada demişdir: "Sizin haqq-hesabınız Allaha aiddir. Şübhəsiz ki, sizdən biriniz yalan danışır. Lakin sənin ona heç bir şeydə haqqın çatmır." (Kişi) dedi: "Bəs mənim malım[1] necə olsun?" Peyğəmbər ﷺ buyurdu: "O sənin malın sayıla bilməz. Çünki əgər sən

[1] Burada mehr nəzərdə tutulur.

doğru deyirsənsə, onda bu, ər-arvad münasibətinə görə verdiyin mal sayılır, yox əgər yalan danışırsansa, onda sənin heç bir halda buna haqqın çatmır." (əl-Buxari, 5312)

## 11-ci fəsil. Yas saxlayan qadın sürmə çəkə (bilərmi?)

## ١١– باب: الْكُحْلُ لِلْحَادَّةِ

١٨٧٥ – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها أَنَّ امْرَأَةً تُوُفِّيَ زَوْجُهَا فَخَشُوا عَلَى عَيْنَيْهَا فَأَتَوْا رَسُولَ اللَّهِ ﷺ فَاسْتَأْذَنُوهُ فِي الْكُحْلِ فَقَالَ لاَ تَكَحَّلْ قَدْ كَانَتْ إِحْدَاكُنَّ تَمْكُثُ فِي شَرِّ أَحْلاَسِهَا أَوْ شَرِّ بَيْتِهَا فَإِذَا كَانَ حَوْلٌ فَمَرَّ كَلْبٌ رَمَتْ بِبَعَرَةٍ فَلاَ حَتَّى تَمْضِيَ أَرْبَعَةُ أَشْهُرٍ وَعَشْرٌ. [رواه البخاري: ٥٣٣٨]

**1875.** Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, (bir dəfə) bir qadının əri öldü. Qadının gözləri ağrıdığından onun (qohum-əqrəbası) Peyğəmbərin ﷺ yanına gəlib ondan xahiş etdilər ki, həmin qadına sürmədən istifadə etməyə izn versin. Peyğəmbər ﷺ dedi: "(Bu qadın) sürmədən istifadə etməməlidir. (Yadınızdadırsa, cahiliyyə dövründə biriniz dul qaldıqda) ən nimdaş paltarını geyərdi və ya ən bərbad evdə qalardı, üstündən bir il keçdikdən sonra onun yanından bir köpək keçsəydi, qadın onun üstünə təzək atardı. Yox, dörd ay on gün keçənədək (sürmədən istifadə etməməlidir)." (əl-Buxari, 5338)

# ٦٩ – كِتَابُ النَّفَقَاتِ

# 69 – (Mal-dövlətin) xərclənməsi kitabı

## ١– باب: فَضْلُ النَّفَقَةِ عَلَى الأَهْلِ

## 1-ci fəsil. Ailəyə xərclənən (mal-dövlətin) üstünlüyü

١٨٧٦ – عَنْ أَبِي مَسْعُودٍ الأَنْصَارِيِّ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: إِذَا أَنْفَقَ الْمُسْلِمُ نَفَقَةً عَلَى أَهْلِهِ وَهُوَ يَحْتَسِبُهَا كَانَتْ لَهُ صَدَقَةً. [رواه البخاري: ٥٣٥١]

**1876.** Əbu Məsud əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir müsəlman əvəzini Allahdan umaraq (malından) ailəsinə bir şey xərcləsə, bu onun üçün sədəqə sayılar." (əl-Buxari, 5351)

١٨٧٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ السَّاعِي عَلَى الأَرْمَلَةِ وَالْمِسْكِينِ كَالْمُجَاهِدِ فِي سَبِيلِ اللَّهِ أَوْ الْقَائِمِ اللَّيْلَ الصَّائِمِ النَّهَارَ. [رواه البخاري: ٥٣٥٣]

**1877.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Dul qadınlara və kasıblara əl tutan kimsə Allah yolunda olan mücahid kimi, habelə, gündüz oruc tutub, gecə namaz qılanlar kimidir." (əl-Buxari, 5353)

## ٢– باب: حَبْسُ نَفَقَةِ الرَّجُلِ قُوتَ سَنَةٍ عَلَى أَهْلِهِ وَكَيْفَ نَفَقَاتُ الْعِيَالِ

## 2-ci fəsil. Kişinin ailəsini bir illik ərzaqla təmin etməsi, üstəlik (mal-dövlət) əhli-əyala necə xərclənməlidir?

١٨٧٨ – عَنْ عُمَرَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَبِيعُ نَخْلَ بَنِي النَّضِيرِ وَيَحْبِسُ لأَهْلِهِ قُوتَ سَنَتِهِمْ. [رواه البخاري: ٥٣٥٧]

**1878.** Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Bəni Nədir qəbiləsinin xurma ağaclarını satar və ailəsi üçün bir illik azuqə hazırlayardı." (əl-Buxari, 5357)

# ٧٠ – كِتَابُ الأَطْعِمَةِ

# 70 – Yeməklər kitabı

## ١ – باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿كُلُواْ مِن طَيِّبَٰتِ مَا رَزَقۡنَٰكُمۡ﴾

## 1-ci fəsil. Uca Allahın: "Sizə ruzi kimi verdiyimiz pak şeylərdən yeyin..."[1] sözü

١٨٧٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَصَابَنِي جَهْدٌ شَدِيدٌ فَلَقِيتُ عُمَرَ بْنَ الْخَطَّابِ فَاسْتَقْرَأْتُهُ آيَةً مِنْ كِتَابِ اللَّهِ فَدَخَلَ دَارَهُ وَفَتَحَهَا عَلَيَّ فَمَشَيْتُ غَيْرَ بَعِيدٍ فَخَرَرْتُ لِوَجْهِي مِنَ الْجَهْدِ وَالْجُوعِ فَإِذَا رَسُولُ اللَّهِ ﷺ قَائِمٌ عَلَى رَأْسِي فَقَالَ يَا أَبَا هُرَيْرَةَ فَقُلْتُ لَبَّيْكَ رَسُولَ اللَّهِ وَسَعْدَيْكَ فَأَخَذَ بِيَدِي فَأَقَامَنِي وَعَرَفَ الَّذِي بِي فَانْطَلَقَ بِي إِلَى رَحْلِهِ فَأَمَرَ لِي بِعُسٍّ مِنْ لَبَنٍ فَشَرِبْتُ مِنْهُ ثُمَّ قَالَ عُدْ يَا أَبَا هِرٍّ فَعُدْتُ فَشَرِبْتُ ثُمَّ قَالَ عُدْ فَعُدْتُ فَشَرِبْتُ حَتَّى اسْتَوَى بَطْنِي فَصَارَ كَالْقِدْحِ قَالَ فَلَقِيتُ عُمَرَ وَذَكَرْتُ لَهُ الَّذِي كَانَ مِنْ أَمْرِي وَقُلْتُ لَهُ فَوَلَّى اللَّهُ ذَلِكَ مَنْ كَانَ أَحَقَّ بِهِ مِنْكَ يَا عُمَرُ وَاللَّهِ لَقَدْ اسْتَقْرَأْتُكَ الآيَةَ وَلأَنَا أَقْرَأُ لَهَا مِنْكَ قَالَ عُمَرُ وَاللَّهِ لأَنْ أَكُونَ أَدْخَلْتُكَ أَحَبُّ إِلَيَّ مِنْ أَنْ يَكُونَ لِي مِثْلُ حُمْرِ النَّعَمِ. [رواه البخاري: ٥٣٧٥]

**1879.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "(Bir dəfə) mən (aclıqdan) taqətdən düşmüşdüm. Həmin vaxt mən Ömər ibn Xəttaba rast gəldim və ondan mənə Allahın Kitabından bir ayəni başa salmağı xahiş etdim. O, evinə daxil oldu və ayəni mənə oxudu. Mən (onun evindən) azacıq aralanmışdım ki, taqətsizlikdən və aclıqdan üzüstə yerə yıxıldım. Bir də baxdım ki, Peyğəmbər ﷺ başımın üstündə durub. O: "Ey Əbu Hureyra!"– deyə xitab etdi. Mən: "Buyur, əmrinə müntəzirəm, ya Rəsulullah"– dedim. O əlimdən tutub məni ayağa qaldırdı. O mənim niyə belə hala düşdüyümü anlayıb məni evinə apardı və (evdəkilərə) mənə bir qab süd gətirməyi buyurdu. Mən süddən (bir qədər) içdikdən sonra Peyğəmbər ﷺ: "Yenə iç, ey Əbu Hirr!"[2]– deyə buyurdu. Mən yenə içdim. Sonra o: "Yenə iç!"– dedi. Mən yenə içdim. Axırda qarnım düzəlib ox kimi dümdüz oldu. Sonra mən yenə Ömərə rast gəldim və başıma gələnləri ona danışıb dedim: "Allah bu işi səndən daha layiqlisinə həvalə etdi, ey Ömər! Vallahi ki, səndən soruşub öyrənmək istədiyim ayəni mən səndən yaxşı bilirdim." Ömər dedi: "Vallahi, səni evimə dəvət edib (yemək-içməyə qonaq etməm) mənim üçün qırmızı dəvələrdən daha sevimlidir." (əl-Buxari, 5375)

## ٢ – باب: التَّسْمِيَةُ عَلَى الطَّعَامِ وَالأَكْلُ بِالْيَمِينِ

## 2-ci fəsil. Yemək yeməyə başladıqda: "Bismillah!"– demək və sağ əllə yemək

١٨٨٠ – عَنْ عُمَرَ بْنِ أَبِي سَلَمَةَ ﷺ قَالَ: كُنْتُ غُلاَمًا فِي حَجْرِ رَسُولِ اللَّهِ ﷺ وَكَانَتْ يَدِي تَطِيشُ فِي الصَّحْفَةِ فَقَالَ لِي رَسُولُ اللَّهِ ﷺ يَا غُلاَمُ سَمِّ اللَّهَ وَكُلْ بِيَمِينِكَ وَكُلْ مِمَّا يَلِيكَ فَمَا زَالَتْ تِلْكَ طِعْمَتِي بَعْدُ. [رواه البخاري: ٥٣٧٦]

---

[1] "əl-Bəqərə" surəsi, 172.

[2] Hirr – pişik, Hureyra – pişikciyəz deməkdir. Əbu Hureyranın ﷺ adı Abdur-Rəhman ibn Səxrdir, pişiklə oynamağı xoşladığına görə Peyğəmbər ﷺ ona belə ləqəb vermişdir.

**1880.** Rəvayət edilir ki, Ömər ibn Əbu Sələmə ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ himayəsi altında böyüyən bir uşaq idim. Yemək yeyəndə mən əlimi qabın hər tərəfinə uzadardım. (Bir dəfə) Peyğəmbər ﷺ mənə belə buyurdu: "Balaca, "bismillah" de, özün də sağ əllə və öz qabağından ye!" O gündən bəri mən yeməyi ancaq bu qaydada yeyirəm." (əl-Buxari, 5376)

## ٣– باب: مَنْ أَكَلَ حَتَّى شَبِعَ

## 3-cü fəsil. Doyunca yemək yeyən kimsə haqqında

١٨٨١ – عَنْ عَائِشَةَ رضي الله عنها تُوُفِّيَ النَّبِيُّ ﷺ حِينَ شَبِعْنَا مِنَ الأَسْوَدَيْنِ التَّمْرِ وَالْمَاءِ. [رواه البخاري: ٥٣٨٣]

**1881.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Biz artıq xurma və sudan doyunca yeyib içməyə (imkanımız olduğu) zaman Peyğəmbər ﷺ vəfat etdi." (əl-Buxari, 5383)

## ٤– باب: الْخُبْزُ الْمُرَقَّقُ وَالأَكْلُ عَلَى الْخِوَانِ وَالسُّفْرَةِ

## 4-cü fəsil. Yumşaq çörək, habelə masa və süfrə arxasında yemək yemək

١٨٨٢ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: مَا أَكَلَ النَّبِيُّ ﷺ خُبْزًا مُرَقَّقًا وَلاَ شَاةً مَسْمُوطَةً حَتَّى لَقِيَ اللَّهَ. [رواه البخاري: ٥٣٨٥]

**1882.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Peyğəmbər ﷺ Rəbbinə qovuşanadək nə bir yumşaq çörək, nə də bütöv qızardılmış bir quzu yemişdir." (əl-Buxari, 5385)

١٨٨٣ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: مَا عَلِمْتُ النَّبِيَّ ﷺ أَكَلَ عَلَى سُكْرُجَةٍ قَطُّ وَلاَ خُبِزَ لَهُ مُرَقَّقٌ قَطُّ وَلاَ أَكَلَ عَلَى خِوَانٍ قَطُّ. [رواه البخاري: ٥٣٨٦]

**1883.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ nə balaca qabda yemək yediyini, nə yumşaq çörək yediyini, nə də masa arxasında yemək yediyini heç vaxt eşitməmişəm." (əl-Buxari, 5386)

## ٥– باب: طَعَامُ الْوَاحِدِ يَكْفِي الاثْنَيْنِ

## 5-ci fəsil. Bir nəfərin yeməyi iki nəfərə bəs edir

١٨٨٤ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ طَعَامُ الاثْنَيْنِ كَافِي الثَّلاَثَةِ وَطَعَامُ الثَّلاَثَةِ كَافِي الأَرْبَعَةِ. [رواه البخاري: ٥٣٩٢]

**1884.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İki nəfərin yeməyi üç nəfərə bəs edər, üç nəfərin yeməyi də dörd nəfərə bəs edər." (əl-Buxari, 5392)

## ٦– باب: الْمُؤْمِنُ يَأْكُلُ فِي مِعًى وَاحِدٍ

## 6-cı fəsil. Mömin bir qarına yemək yeyir

١٨٨٥ – عَنْ نَافِعٍ قَالَ: كَانَ ابْنُ عُمَرَ رضي الله عنهما لاَ يَأْكُلُ حَتَّى يُؤْتَى بِمِسْكِينٍ يَأْكُلُ مَعَهُ فَأَدْخَلْتُ رَجُلاً يَأْكُلُ مَعَهُ فَأَكَلَ كَثِيرًا فَقَالَ يَا نَافِعُ لاَ تُدْخِلْ هَذَا عَلَيَّ سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ الْمُؤْمِنُ يَأْكُلُ فِي مِعًى وَاحِدٍ وَالْكَافِرُ يَأْكُلُ فِي سَبْعَةِ أَمْعَاءٍ. [رواه البخاري: ٥٣٩٣]

**1885.** Nafi rəvayət edir ki, ibn Ömər ﷺ süfrə arxasına əyləşdikdə yanına bir kasıb dəvət etməyincə yemək yeməzdi. Bir dəfə mən yenə onun yanına bir (kasıb) gətirdim. Adam olduqca çox yemək yedi. (Onda ibn Ömər mənə) dedi: “Bir də bunu mənim yanıma gətirmə. Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Mömin bir qarına yemək yeyir, kafir isə yeddi qarına.” (əl-Buxari, 5393)

## 7-ci fəsil. Dirsəklənmiş halda yemək yemək

## ٧– باب: الأَكْلُ مُتَّكِئًا

١٨٨٦ – عَنْ أَبِي جُحَيْفَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لاَ آكُلُ مُتَّكِئًا. [رواه البخاري: ٥٣٩٩]

**1886.** Əbu Cuheyfə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən dirsəklənmiş halda yemirəm.” (əl-Buxari, 5399)

## 8-ci fəsil. Peyğəmbər ﷺ heç vaxt heç bir yeməyi pisləməyib

## ٨– باب: مَا عَابَ النَّبِيُّ ﷺ طَعَامًا

١٨٨٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: مَا عَابَ النَّبِيُّ ﷺ طَعَامًا قَطُّ إِنْ اشْتَهَاهُ أَكَلَهُ وَإِنْ كَرِهَهُ تَرَكَهُ. [رواه البخاري: ٥٤٠٩]

**1887.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Peyğəmbər ﷺ heç vaxt heç bir yeməyi pisləməzdi. Yemək xoşuna gəldikdə onu yeyər, əks halda isə onu tərk edərdi.” (əl-Buxari, 5409)

## 9-cu fəsil. (Üyüdülmüş) arpaya (içindəki qabıqları təmizləmək üçün) üfürmək

## ٩– باب: النَّفْخُ فِي الشَّعِيرِ

١٨٨٨ – عَنْ سَهْلٍ ﷺ قِيلَ لَهُ: هَلْ رَأَيْتُمْ فِي زَمَانِ النَّبِيِّ ﷺ النَّقِيَّ قَالَ لاَ قِيلَ: فَهَلْ كُنْتُمْ تَنْخُلُونَ الشَّعِيرَ قَالَ لاَ وَلَكِنْ كُنَّا نَنْفُخُهُ. [رواه البخاري: ٥٤١٠]

**1888.** Rəvayət edilir ki, Səhldən ﷺ soruşdular: “Siz Peyğəmbərin ﷺ dövründə təmiz ağ un görmüşdünüzmü?” O: “Xeyr”– dedi. (Yenə) soruşdular: “Siz arpa üyüdürdünüzmü?” O dedi: “Xeyr, biz sadəcə onun (içindəki qabıqları təmizləmək üçün) üfürərdik.” (əl-Buxari, 5410)

## 10-cu fəsil. Peyğəmbərin ﷺ və onun əshabələrinin yedikləri

## ١٠– باب: مَا كَانَ النَّبِيُّ ﷺ وَأَصْحَابُهُ يَأْكُلُونَ

١٨٨٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَسَمَ النَّبِيُّ ﷺ يَوْمًا بَيْنَ أَصْحَابِهِ تَمْرًا فَأَعْطَى كُلَّ إِنْسَانٍ سَبْعَ تَمَرَاتٍ فَأَعْطَانِي سَبْعَ تَمَرَاتٍ إِحْدَاهُنَّ حَشَفَةٌ فَلَمْ يَكُنْ فِيهِنَّ تَمْرَةٌ أَعْجَبَ إِلَيَّ مِنْهَا شَدَّتْ فِي مَضَاغِي. [رواه البخاري: ٥٤١١]

**1889.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Bir gün Peyğəmbər ﷺ bir miqdar xurmanı əshabələri arasında bölüşdürdü və hər kəsə, habelə mənə də yeddi dənə xurma verdi. Bu xurmalardan biri quru idi və tam yetişməmişdi. Lakin bu xurmalar içində mənim ən çox sevdiyim məhz bu xurma idi. (Çünki) onu çeynəmək mənə çox çətin idi." (əl-Buxari, 5411)

**١٨٩٠ –** عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّهُ مَرَّ بِقَوْمٍ بَيْنَ أَيْدِيهِمْ شَاةٌ مَصْلِيَّةٌ فَدَعَوْهُ فَأَبَى أَنْ يَأْكُلَ وَقَالَ خَرَجَ رَسُولُ اللَّهِ ﷺ مِنَ الدُّنْيَا وَلَمْ يَشْبَعْ مِنْ خُبْزِ الشَّعِيرِ. [رواه البخاري: ٥٤١٤]

**1890.** Rəvayət edilir ki, (bir dəfə) Əbu Hureyra ﷺ qarşılarında qızardılmış qoyun qoyulmuş bir dəstə adamın yanından keçərkən onlar onu yeməyə dəvət etdi. O isə bundan imtina etdi və dedi: "Peyğəmbər ﷺ arpa çörəyindən doyunca yemədiyi halda dünyadan köçüb getdi." (əl-Buxari, 5414)

**١٨٩١ –** عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: مَا شَبِعَ آلُ مُحَمَّدٍ ﷺ مُنْذُ قَدِمَ الْمَدِينَةَ مِنْ طَعَامِ الْبُرِّ ثَلاَثَ لَيَالٍ تِبَاعًا حَتَّى قُبِضَ. [رواه البخاري: ٥٤١٦]

**1891.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Muhəmmədin ﷺ ailəsi Mədinəyə gəldiyi gündən ta onun vəfat etdiyi günədək (heç vaxt) üç gün dalbadal buğda çörəyindən doyunca yeməmişdir." (əl-Buxari, 5416)

## 11-ci fəsil. Təlbinə[1] — ١١ – باب: التَّلْبِينَةُ

**١٨٩٢ –** عَنْ عَائِشَةَ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّهَا كَانَتْ إِذَا مَاتَ الْمَيِّتُ مِنْ أَهْلِهَا فَاجْتَمَعَ لِذَلِكَ النِّسَاءُ ثُمَّ تَفَرَّقْنَ إِلاَّ أَهْلَهَا وَخَاصَّتَهَا أَمَرَتْ بِبُرْمَةٍ مِنْ تَلْبِينَةٍ فَطُبِخَتْ ثُمَّ صُنِعَ ثَرِيدٌ فَصُبَّتْ التَّلْبِينَةُ عَلَيْهَا ثُمَّ قَالَتْ كُلْنَ مِنْهَا فَإِنِّي سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ التَّلْبِينَةُ مُجِمَّةٌ لِفُؤَادِ الْمَرِيضِ تَذْهَبُ بِبَعْضِ الْحُزْنِ. [رواه البخاري: ٥٤١٧]

**1892.** Peyğəmbərin ﷺ zövcəsi Aişə ﷺ rəvayət etmişdir ki, onun qohumlarından bir kimsə vəfat etdikdə qadınlar bir yerə yığışar, (başsağlığı verər), sonra da ailə üzvlərindən və ən yaxın rəfiqələrindən başqa hamı dağılışıb gedərdi. (Bundan sonra) onun göstərişi ilə təlbinə bişirilər və şorba hazırlanar, sonra da təlbinəni ona qatardılar. (Yemək hazır olduqda) Aişə ﷺ onlara deyərdi: "Bundan yeyin! Çünki mən Peyğəmbərin ﷺ: "Təlbinə xəstənin qəlbinə təskinlik verir və kədərini aradan qaldırır"– dediyini eşitmişəm." (əl-Buxari, 5417)

## 12-ci fəsil. Gümüşlə bəzədilmiş qabda yeməyin (hökmü) — ١٢ – باب: الأَكْلُ فِي إِنَاءٍ مُفَضَّضٍ

**١٨٩٣ –** عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ لاَ تَلْبَسُوا الْحَرِيرَ وَلاَ الدِّيبَاجَ وَلاَ تَشْرَبُوا فِي آنِيَةِ الذَّهَبِ وَالْفِضَّةِ وَلاَ تَأْكُلُوا فِي صِحَافِهَا فَإِنَّهَا لَهُمْ فِي الدُّنْيَا وَلَنَا فِي الآخِرَةِ. [رواه البخاري: ٥٤٢٦]

[1] Un və bal yaxud süd ilə yoğrulub bişirilmiş yemək.

**1893.** Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşitmişəm: "İpək və zərxara geyinməyin, qızıl və gümüş qablarda su içməyin, belə qablarda yemək də yeməyin. Çünki bütün bunlar onlara dünyada, sizə isə axirətdə nəsib olacaq." (əl-Buxari, 5426)

## 13-cü fəsil. (Din) qardaşlarının yeməyini təmin etməyi boynuna çəkən kimsə haqqında

## ١٣– باب: الرَّجُلُ يَتَكَلَّفُ الطَّعَامَ لإِخْوَانِهِ

١٨٩٤ – عَنْ أَبِي مَسْعُودٍ الأَنْصَارِيِّ ﵁ قَالَ: كَانَ مِنَ الأَنْصَارِ رَجُلٌ يُقَالُ لَهُ أَبُو شُعَيْبٍ وَكَانَ لَهُ غُلاَمٌ لَحَّامٌ فَقَالَ اصْنَعْ لِي طَعَامًا أَدْعُو رَسُولَ اللَّهِ ﷺ خَامِسَ خَمْسَةٍ فَدَعَا رَسُولَ اللَّهِ ﷺ خَامِسَ خَمْسَةٍ فَتَبِعَهُمْ رَجُلٌ فَقَالَ النَّبِيُّ ﷺ إِنَّكَ دَعَوْتَنَا خَامِسَ خَمْسَةٍ وَهَذَا رَجُلٌ قَدْ تَبِعَنَا فَإِنْ شِئْتَ أَذِنْتَ لَهُ وَإِنْ شِئْتَ تَرَكْتَهُ قَالَ بَلْ أَذِنْتُ لَهُ. [رواه البخاري: ٥٤٣٤]

**1894.** Rəvayət edilir ki, Əbu Məsud əl-Ənsari ﵁ demişdir: "Ənsarın arasında Əbu Şueyb adlı bir kişi var idi. Bu kişinin qəssablıq edən bir köləsi var idi. (Bir dəfə kişi ona): "Mənim üçün elə yemək hazırla ki, Peyğəmbərlə ﷺ birlikdə beş nəfər adamı (yeməyə) dəvət edə bilim." Sonra o, Peyğəmbəri ﷺ beş nəfərin beşincisi olaraq yeməyə dəvət etdi. (Yolda) bir nəfər onlara qoşuldu. Peyğəmbər ﷺ (ev sahibinə) dedi: "Sən bizim beşimizi (yeməyə) dəvət etdin. (Yolda) bu adam bizə qoşuldu. İstəyirsən, izn ver (o da bizimlə gəlsin), istəyirsənsə, çıxıb getsin." Kişi dedi: "Yox, izn verirəm, qoy gəlsin." (əl-Buxari, 5434)

## 14-cü fəsil. (Yeməyə) xurma və xiyar qatmaq

## ١٤– باب: الرُّطَبُ بِالْقِثَّاءِ

١٨٩٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ جَعْفَرِ بْنِ أَبِي طَالِبٍ ﵄ قَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ يَأْكُلُ الرُّطَبَ بِالْقِثَّاءِ. [رواه البخاري: ٥٤٤٠]

**1895.** Rəvayət edilir ki, Abdullah ibn Cəfər ibn Əbu Talib ﵄ demişdir: "Mən Peyğəmbərin ﷺ tər xurma ilə xiyar yediyini görmüşəm." (əl-Buxari, 5440)

## 15-ci fəsil. Tər xurma və qurumuş xurma haqqında

## ١٥– باب: الرُّطَبُ وَالتَّمْرُ

١٨٩٦ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﵄ قَالَ: كَانَ بِالْمَدِينَةِ يَهُودِيٌّ وَكَانَ يُسْلِفُنِي فِي تَمْرِي إِلَى الْجِدَادِ وَكَانَتْ لِجَابِرٍ الأَرْضُ الَّتِي بِطَرِيقِ رُومَةَ فَجَلَسَتْ فَخَلاَ عَامًا فَجَاءَنِي الْيَهُودِيُّ عِنْدَ الْجَدَادِ وَلَمْ أَجُدَّ مِنْهَا شَيْئًا فَجَعَلْتُ أَسْتَنْظِرُهُ إِلَى قَابِلٍ فَيَأْبَى فَأُخْبِرَ بِذَلِكَ النَّبِيُّ ﷺ فَقَالَ لأَصْحَابِهِ امْشُوا نَسْتَنْظِرْ لِجَابِرٍ مِنَ الْيَهُودِيِّ فَجَاءُونِي فِي نَخْلِي فَجَعَلَ النَّبِيُّ ﷺ يُكَلِّمُ الْيَهُودِيَّ فَيَقُولُ أَبَا الْقَاسِمِ لاَ أُنْظِرُهُ فَلَمَّا رَأَى النَّبِيُّ ﷺ قَامَ فَطَافَ فِي النَّخْلِ ثُمَّ جَاءَهُ فَكَلَّمَهُ فَأَبَى فَقُمْتُ فَجِئْتُ بِقَلِيلِ رُطَبٍ فَوَضَعْتُهُ بَيْنَ يَدَيِ النَّبِيِّ ﷺ فَأَكَلَ ثُمَّ قَالَ أَيْنَ عَرِيشُكَ يَا جَابِرُ فَأَخْبَرْتُهُ فَقَالَ افْرُشْ لِي فِيهِ فَفَرَشْتُهُ فَدَخَلَ فَرَقَدَ ثُمَّ اسْتَيْقَظَ فَجِئْتُهُ بِقَبْضَةٍ أُخْرَى فَأَكَلَ مِنْهَا ثُمَّ قَامَ فَكَلَّمَ الْيَهُودِيَّ فَأَبَى عَلَيْهِ فَقَامَ فِي

الرِّطَابِ فِي النَّخْلِ الثَّانِيَةَ ثُمَّ قَالَ يَا جَابِرُ جُدَّ وَاقْضِ فَوَقَفَ فِي الْجَدَادِ فَجَدَدْتُ مِنْهَا مَا قَضَيْتُهُ وَفَضَلَ مِنْهُ فَخَرَجْتُ حَتَّى جِئْتُ النَّبِيَّ ﷺ فَبَشَّرْتُهُ فَقَالَ أَشْهَدُ أَنِّي رَسُولُ اللَّهِ. [رواه البخاري: ٥٤٤٣]

**1896.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Mədinədə bir yəhudi var idi. O, (mənim bağımda bitən) xurmaların pulunu qabaqcadan ödəyərdi. Cabirin xurmalığı Ruma quyusuna aparan yolun üstündə idi. İllərdən birində bu xurma bağı bar vermədi. Məhsul yığımı vaxtı yəhudi gəlib (məndən xurmalarını tələb etdikdə) mən ona verməyə bir şey tapmadım və ondan mənə növbəti ilədək möhlət verməyi xahiş etdim, lakin o buna razı olmadı. Bu haqda Peyğəmbərə ﷺ xəbər verildikdə o öz əshabələrinə dedi: "Qalxın, gedək yəhudidən Cabir üçün möhlət diləyək." Mən xurma bağımda ikən onlar mənim yanıma gəldilər. Peyğəmbər ﷺ yəhudini yola gətirməyə çalışdı, o isə: "Ey Əbul Qasım, mən ona möhlət verməyəcəyəm"- deyirdi. (Bunun bir nəticə vermədiyini) görəndə Peyğəmbər ﷺ qalxıb bağda gəzişdi, sonra yəhudinin yanına gəlib bir də onu dilə tutdu, lakin o yenə razı olmadı. Onda mən qalxıb bir az xurma gətirdim və onu Peyğəmbərin ﷺ qabağına qoydum. O (bu xurmadan) yedikdən sonra soruşdu: "Hanı sənin çadırın, ey Cabir?" (Mən çadırın harada olduğunu) ona bildirdim. Peyğəmbər ﷺ: "Onun içində mənim üçün yer sal!"- dedi, mən də (onun üçün) yer saldım. Sonra o, (çadıra) daxil oldu və uzanıb yatdı. Bir müddətdən sonra Peyğəmbər ﷺ oyandı və mən ona yenə bir ovuc xurma gətirdim. O bu xurmadan yedikdən sonra gedib bir daha yəhudi ilə danışdı. Yəhudi yenə də onunla razılaşmadı. Onda Peyğəmbər ﷺ xurmalıqların arasında durub dedi: "Ey Cabir, xurmaları yığ və borcunu ödə!" Mən xurmaları yığarkən Peyğəmbər ﷺ yanımda durdu. Mən yəhudinin borcunu ödəyəcək qədər xurma yığdım, hələ artıq da qaldı. Sonra mən Peyğəmbərin ﷺ yanına gəlib onu sevindirdim. Peyğəmbər ﷺ buyurdu: "Şəhadət verirəm ki, mən Allahın elçisiyəm!" (əl-Buxari, 5443)

## 16-cı fəsil. Əcva[1]

## ١٦- باب: الْعَجْوَةُ

١٨٩٧ – عَنْ سَعْد ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ مَنْ تَصَبَّحَ كُلَّ يَوْمٍ سَبْعَ تَمَرَاتٍ عَجْوَةً لَمْ يَضُرَّهُ فِي ذَلِكَ الْيَوْمِ سُمٌّ وَلاَ سِحْرٌ. [رواه البخاري: ٥٤٤٥]

**1897.** Səd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim hər səhər Əcva xurmasından yeddi dənə yesə, həmin gün ona nə zəhər, nə də sehr təsir edə bilməz." (əl-Buxari, 5445)

## 17-ci fəsil. (Yeməyi qurtardıqdan sonra) barmaqları yalamaq

## ١٧- باب: لَعْقُ الأَصَابِعِ

١٨٩٨ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ إِذَا أَكَلَ أَحَدُكُمْ فَلاَ يَمْسَحْ يَدَهُ حَتَّى يَلْعَقَهَا أَوْ يُلْعِقَهَا. [رواه البخاري: ٥٤٥٦]

[1] Xurma növü.

**1898.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biriniz yemək yedikdə əlini yalamayınca və ya (əhli-əyalına) yalatdırmayınca onu (heç nəyə) silməsin." (əl-Buxari, 5456)

١٨٩٩ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ: كُنَّا زَمَانَ النَّبِيِّ ﷺ لاَ نَجِدُ مِثْلَ ذَلِكَ مِنَ الطَّعَامِ إِلاَّ قَلِيلاً فَإِذَا نَحْنُ وَجَدْنَاهُ لَمْ يَكُنْ لَنَا مَنَادِيلُ إِلاَّ أَكُفَّنَا وَسَوَاعِدَنَا وَأَقْدَامَنَا ثُمَّ نُصَلِّي وَلاَ نَتَوَضَّأُ. [رواه البخاري: ٥٤٥٧]

**1899.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Biz peyğəmbərin ﷺ zamanında (odda bişmiş) belə yeməklərdən çox az tapa bilərdik. O zaman biz belə yeməklər yedikdə cib dəsmalımız olmadığından (əllərimizi) biləyimizə, sinəmizə və ayağımıza silərdik. Sonra da qalxıb dəstəmaz almadan namaz qılardıq.[1]" (əl-Buxari, 5457)

## 18-ci fəsil. Yemək yeyib qurtardıqdan sonra nə demək lazımdır?

## ١٨ – باب: مَا يَقُولُ إِذَا فَرَغَ مِنْ طَعَامِهِ

١٩٠٠ – عَنْ أَبِي أُمَامَةَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا رَفَعَ مَائِدَتَهُ قَالَ الْحَمْدُ لِلَّهِ حَمْداً كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ غَيْرَ مَكْفِيٍّ وَلاَ مُوَدَّعٍ وَلاَ مُسْتَغْنًى عَنْهُ رَبَّنَا. [رواه البخاري: ٥٤٥٨]

**1900.** Əbu Umamə ﷺ rəvayət edir ki, yemək süfrəsi yığışdırıldıqda Peyğəmbər ﷺ deyərdi: "Əlhəmdulillahi həmdən kəsiran tayyibən mubarəkən fihi ğayra məkfiyyin və lə muvəddəin və lə mustəğnə anhu Rabbənə.[2]" (əl-Buxari, 5458)

١٩٠١ – عَنْ أَبِي أُمَامَةَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ إِذَا رَفَعَ مَائِدَتَهُ قَالَ الْحَمْدُ لِلَّهِ الَّذِي كَفَانَا وَأَرْوَانَا غَيْرَ مَكْفِيٍّ وَلاَ مَكْفُورٍ. [رواه البخاري: ٥٤٥٩]

**1901.** Əbu Umamə ﷺ rəvayət edir ki, yemək süfrəsi yığışdırıldıqda Peyğəmbər ﷺ deyərdi: "Əlhəmdulillahil-ləzi kəfanə və ərvanə ğayra məkfiyyin və lə məkfurin.[3]" (əl-Buxari, 5459)

## 19-cu fəsil. Uca Allahın: "...yemək yedikdən sonra bir-birinizlə söhbətə dalmadan dağılışın."[4] sözü

## ١٩ – باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿فَإِذَا طَعِمۡتُمۡ فَٱنتَشِرُواْ﴾

١٩٠٢ – عَنْ أَنَسٍ ﷺ قَالَ: أَنَا أَعْلَمُ النَّاسِ بِالْحِجَابِ كَانَ أُبَيُّ بْنُ كَعْبٍ يَسْأَلُنِي عَنْهُ أَصْبَحَ رَسُولُ اللَّهِ ﷺ عَرُوسًا بِزَيْنَبَ بِنْتِ جَحْشٍ وَكَانَ تَزَوَّجَهَا بِالْمَدِينَةِ فَدَعَا النَّاسَ لِلطَّعَامِ بَعْدَ ارْتِفَاعِ النَّهَارِ فَجَلَسَ رَسُولُ اللَّهِ ﷺ وَجَلَسَ مَعَهُ

---

[1] Bu hədis odda bişmiş yeməkdən yeyən adamın dəstəmaz almağına lüzum olmadığına dəlalət edir.

[2] Tərcüməsi: Rəbbimiz Allaha həmd olsun, (özü də) çoxlu, xoş, mübarək, sonsuz, ardı-arası kəsilməyən, onsuz keçinmək mümkün olmayan bir həmd!

[3] Tərcüməsi: Ehtiyacımızı ödəyən və susuzluğumuzu yatıran Allaha həmd olsun, (özü də) sonsuz və inkar olunmayan bir həmd!

[4] "əl-Əhzab" surəsi, 53.

رِجَالٌ بَعْدَ مَا قَامَ الْقَوْمُ حَتَّى قَامَ رَسُولُ اللَّه ﷺ فَمَشَى وَمَشَيْتُ مَعَهُ حَتَّى بَلَغَ بَابَ حُجْرَةِ عَائِشَةَ ثُمَّ ظَنَّ أَنَّهُمْ خَرَجُوا فَرَجَعْتُ مَعَهُ فَإِذَا هُمْ جُلُوسٌ مَكَانَهُمْ فَرَجَعَ وَرَجَعْتُ مَعَهُ الثَّانِيَةَ حَتَّى بَلَغَ بَابَ حُجْرَةِ عَائِشَةَ فَرَجَعَ وَرَجَعْتُ مَعَهُ فَإِذَا هُمْ قَدْ قَامُوا فَضَرَبَ بَيْنِي وَبَيْنَهُ سِتْرًا وَأُنْزِلَ الْحِجَابُ. [رواه البخاري: ٥٤٦٦]

**1902.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Mən hicab ayəsi haqqındakı məlumatı hamıdan yaxşı bilirəm. Vaxtı ilə Ubey ibn Kəb bu haqda məndən soruşardı. Peyğəmbər ﷺ Mədinədə Zeynəb bint Cəhş ilə evləndi. Zifaf gecəsinin səhəri günəş yüksəldikdən sonra Peyğəmbər ﷺ camaatı yemək-içməyə dəvət etdi. Hamı dağılışıb getsə də, bir neçə nəfər Peyğəmbərin ﷺ yanında qaldı. İş o yerə gəlib çatdı ki, Peyğəmbər ﷺ özü durub getdi, mən də onunla birlikdə getdim. Nəhayət, o gəlib Aişənin hücrəsinin qapısına çatdı. Bir qədər keçdikdən sonra o, evindəki adamların çıxıb getdiyini zənn edib evə qayıtdı və mən də onunla birlikdə geri qayıtdım. Lakin gəlib gördü ki, onlar hələ də oradadırlar. Yenə çıxıb getdi və mən də onunla birlikdə getdim. Yenə Aişənin hücrəsinin qapısına çatdı və bir qədər gözlədikdən sonra geri qayıtdı və mən də onunla birlikdə qayıtdım. O adamlar artıq çıxıb getmişdilər. Onda Peyğəmbər ﷺ mənimlə öz (ailəsi) arasına pərdə tutdu və beləliklə də hicab ayəsi nazil oldu." (əl-Buxari, 5466)

# ٧١ – كِتَابُ العَقِيقَةِ

# 71 – Əqiq[1] kitabı

## 1-ci fəsil. Uşağa ad qoymaq

## ١ – باب: تَسْمِيَةُ الْمَوْلُودِ

١٩٠٣ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: وُلِدَ لِي غُلاَمٌ فَأَتَيْتُ بِهِ النَّبِيَّ ﷺ فَسَمَّاهُ إِبْرَاهِيمَ فَحَنَّكَهُ بِتَمْرَةٍ وَدَعَا لَهُ بِالْبَرَكَةِ وَدَفَعَهُ إِلَيَّ وَكَانَ أَكْبَرَ وَلَدِ أَبِي مُوسَى. [رواه البخاري: ٥٤٦٧]

**1903.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "Mənim uşağım olduqda mən onu Peyğəmbərin ﷺ yanına gətirdim. Peyğəmbər ﷺ uşağa İbrahim adını verdi, xurmanı ağzında əzib körpənin ağzına qoydu,[2] onun üçün xeyir-bərəkət dilədi və onu mənə qaytardı." (Bu uşaq) Əbu Musanın ﷺ yaşca ən böyük övladı idi. (əl-Buxari, 5467)

١٩٠٤ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ﷺ أَنَّهَا حَمَلَتْ بِعَبْدِ اللَّهِ بْنِ الزُّبَيْرِ بِمَكَّةَ قَالَتْ فَخَرَجْتُ وَأَنَا مُتِمٌّ فَأَتَيْتُ الْمَدِينَةَ فَنَزَلْتُ قُبَاءً فَوَلَدْتُ بِقُبَاءٍ ثُمَّ أَتَيْتُ بِهِ رَسُولَ اللَّهِ ﷺ فَوَضَعْتُهُ فِي حَجْرِهِ ثُمَّ دَعَا بِتَمْرَةٍ فَمَضَغَهَا ثُمَّ تَفَلَ فِي فِيهِ فَكَانَ أَوَّلَ شَيْءٍ دَخَلَ جَوْفَهُ رِيقُ رَسُولِ اللَّهِ ﷺ ثُمَّ حَنَّكَهُ بِالتَّمْرَةِ ثُمَّ دَعَا لَهُ فَبَرَّكَ عَلَيْهِ وَكَانَ أَوَّلَ مَوْلُودٍ وُلِدَ فِي الإِسْلاَمِ فَفَرِحُوا بِهِ فَرَحًا شَدِيدًا لأَنَّهُمْ قِيلَ لَهُمْ إِنَّ الْيَهُودَ قَدْ سَحَرَتْكُمْ فَلاَ يُولَدُ لَكُمْ. [رواه البخاري: ٥٤٦٩]

**1904.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr ﷺ Məkkədə ikən Abdullah ibn Zubeyrə hamilə qaldı. (Əsma) dedi: "Mən hamiləliyin son ayında (Məkkədən) çıxıb Mədinəyə gəldim və Qubada qonaq qaldım. (Elə orada da övladımı dünyaya gətirdim.) Sonra uşağı Peyğəmbərin ﷺ yanına gətirdim və onu Peyğəmbərin ﷺ qucağına qoydum. Peyğəmbər ﷺ bir xurma gətizdirdi, sonra onu ağzında əzdi və (bu əzməni) uşağın ağzına qoydu. Beləliklə də, bu körpənin mədəsinə gedən ilk şey Peyğəmbərin ﷺ ağız suyu oldu. Sonra Peyğəmbər ﷺ xurma əziyini körpənin damağına sürtdü və onun üçün dua edib Allahdan xeyir-bərəkət dilədi. Beləcə, o, İslamda doğulmuş ilk körpə oldu. (Müsəlmanlar) buna həddən artıq sevindilər. Çünki onlara demişdilər ki: "Yəhudilər sizə sehr edib, (Mədinədə) sizin övladınız olmayacaq." (əl-Buxari, 5469)

## 2-ci fəsil. Əqiq əsnasında uşağa əziyyət verən (bütün şeyləri)[3] ondan kənar edin

## ٢ – باب: إِمَاطَةُ الأَذَى عَنْ الصَّبِيِّ فِي الْعَقِيقَةِ

١٩٠٥ – عَنْ سَلْمَانَ بْنِ عَامِرٍ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: مَعَ الْغُلاَمِ عَقِيقَةٌ فَأَهْرِيقُوا عَنْهُ دَمًا وَأَمِيطُوا عَنْهُ الأَذَى. [رواه البخاري: ٥٤٧٢]

[1] Şükür əlaməti olaraq oğlan uşağı doğulduqda iki, qız uşağı doğulduqda isə bir qoç kəsmək.
[2] 765-ci hədisin qeydlərinə bax.
[3] Hədisdə uşağın başına təzə tük çıxsın deyə başını qırxmaq və cahiliyyə dövründə olduğu kimi qoyunun qanından onun baş-gözünə sürtməmək nəzərdə tutulur.

**1905.** Rəvayət edilir ki, Salman ibn Amir ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Doğulmuş körpə üçün qoç kəsilməlidir. Elə isə onun üçün qoç kəsin və əziyyət verən (bütün şeyləri) ondan kənar edin." (əl-Buxari, 5472)

## 3-cü fəsil. Fərə[1]

## ٣– باب: الْفَرَعُ

**١٩٠٦ –** عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: لاَ فَرَعَ وَلاَ عَتِيرَةَ وَالْفَرَعُ أَوَّلُ النِّتَاجِ كَانُوا يَذْبَحُونَهُ لِطَوَاغِيتِهِمْ وَالْعَتِيرَةُ فِي رَجَبٍ. [رواه البخاري: ٥٤٧٣]

**1906.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Nə fərə, nə də atirə (din sayıla bilməz)."

(Hədisi danışan ravi demişdir): "Fərə: (qoyunun və ya dəvənin) birinci balasıdır ki, müşriklər onu öz bütlərinə qurban kəsərdilər. Atirə isə (onların) rəcəb ayında (kəsdikləri qurbandır)." (əl-Buxari, 5473)

[1] Üç şeydən biri: a) qoyunun və ya dəvənin birinci balasını bütlərə qurban vermək. b) dəvələrin sayı müəyyən bir miqdara çatdıqda qurban kəsmək. v) dəvə balaladıqda ziyafət vermək.

# ٧٢ – كِتَابُ الذَّبَائِحِ وَ الصَّيْدِ

# 72 – Boğazlanmış heyvanlar və ov kitabı

## ١ – باب:
التَّسْمِيَةُ عَلَى الصَّيْدِ وَقَوْلُهُ تَعَالَى: ﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ لَيَبۡلُوَنَّكُمُ ٱللَّهُ بِشَيۡءٖ مِّنَ ٱلصَّيۡدِ تَنَالُهُۥٓ أَيۡدِيكُمۡ وَرِمَاحُكُمۡ ﴾ إِلَى قَوْلِهِ: ﴿عَذَابٌ أَلِيمٌ ﴾

**1-ci fəsil. Ov etdikdə "bismillah" demək. Uca Allah buyurur: "Ey iman gətirənlər! Allah sizi əllərinizin və nizələrinizin çata biləcəyi bir ovla imtahan edəcək ki, Allah, gizlində (yaxud Onun Özünü görmədən) kimin Ondan qorxduğunu üzə çıxarsın. Bundan sonra həddi aşan kimsə üçün isə ağrılı-acılı bir əzab hazırlanmışdır."[1]**

١٩٠٧ – عَنْ عَدِيِّ بْنِ حَاتِمٍ ﷺ قَالَ: سَأَلْتُ النَّبِيَّ ﷺ عَنْ صَيْدِ الْمِعْرَاضِ قَالَ مَا أَصَابَ بِحَدِّهِ فَكُلْهُ وَمَا أَصَابَ بِعَرْضِهِ فَهُوَ وَقِيذٌ وَسَأَلْتُهُ عَنْ صَيْدِ الْكَلْبِ فَقَالَ مَا أَمْسَكَ عَلَيْكَ فَكُلْ فَإِنَّ أَخْذَ الْكَلْبِ ذَكَاةٌ وَإِنْ وَجَدْتَ مَعَ كَلْبِكَ أَوْ كِلَابِكَ كَلْبًا غَيْرَهُ فَخَشِيتَ أَنْ يَكُونَ أَخَذَهُ مَعَهُ وَقَدْ قَتَلَهُ فَلاَ تَأْكُلْ فَإِنَّمَا ذَكَرْتَ اسْمَ اللَّهِ عَلَى كَلْبِكَ وَلَمْ تَذْكُرْهُ عَلَى غَيْرِهِ. [رواه البخاري: ٥٤٧٥]

**1907.** Rəvayət edilir ki, Adiy ibn Hatim ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərdən ﷺ mirad deyilən oxla vurulmuş ov barəsində soruşdum. Peyğəmbər ﷺ dedi: "Oxun iti ucu ilə vurulmuşsa, yeyə bilərsən, yox əgər gövdəsi ilə vurulub öldürülmüşsə, bu vəqizdir.[2]" Mən ondan ov itinin (ovladığı heyvan) barəsində soruşdum. Dedi: "Sənin üçün tutduğundan yeyə bilərsən. Çünki ov itinin tutduğu heyvan murdar sayılmır. Hərgah öz itinin və ya itlərinin yanında başqa bir it görsən, onun ova toxunduğundan ehtiyat etsən, yemə. Çünki sən öz itini ovun üstünə göndərəndə "bismillah" demisən, o biri itin üçün isə Allahın adını çəkməmisən." (əl-Buxari, 5475)

## ٢– باب: صَيْدُ الْقَوْسِ

**2-ci fəsil. Yay** (və oxla) **ov ovlamaq**

١٩٠٨ – عَنْ أَبِي ثَعْلَبَةَ الْخُشَنِيِّ ﷺ قَالَ: قُلْتُ يَا نَبِيَّ اللَّهِ إِنَّا بِأَرْضِ قَوْمٍ مِنْ أَهْلِ الْكِتَابِ أَفَنَأْكُلُ فِي آنِيَتِهِمْ وَبِأَرْضِ صَيْدٍ أَصِيدُ بِقَوْسِي وَبِكَلْبِي الَّذِي لَيْسَ بِمُعَلَّمٍ وَبِكَلْبِي الْمُعَلَّمِ فَمَا يَصْلُحُ لِي قَالَ أَمَّا مَا ذَكَرْتَ مِنْ أَهْلِ الْكِتَابِ فَإِنْ وَجَدْتُمْ غَيْرَهَا فَلاَ تَأْكُلُوا فِيهَا وَإِنْ لَمْ تَجِدُوا فَاغْسِلُوهَا وَكُلُوا فِيهَا وَمَا صِدْتَ بِقَوْسِكَ فَذَكَرْتَ اسْمَ اللَّهِ فَكُلْ وَمَا صِدْتَ بِكَلْبِكَ الْمُعَلَّمِ فَذَكَرْتَ اسْمَ اللَّهِ فَكُلْ وَمَا صِدْتَ بِكَلْبِكَ غَيْرِ مُعَلَّمٍ فَأَدْرَكْتَ ذَكَاتَهُ فَكُلْ. [رواه البخاري: ٥٤٧٨]

---

[1] "əl-Maidə" surəsi, 94.

[2] Zopa ilə vurulub öldürülən heyvana vəqiz deyilir. Belə heyvanın ətini yemək haram buyurulmuşdur. Uca Allah buyurur: **"Leş, qan, donuz əti, Allahdan başqasının adı ilə kəsilmiş, boğulmuş, döyülüb öldürülmüş, *hündür bir yerdən* yıxılıb gəbərmiş, buynuzlanıb öldürülmüş, yırtıcı heyvan tərəfindən parçalanıb yeyilmiş, – ölməmiş kəsdikləriniz istisnadır, dik qoyulmuş daşlar (bütlər və s.) üzərində kəsilmiş heyvanlar və fal oxları ilə qismət axtarmanız sizə haram edildi..."** "əl-Maidə" surəsi, 3.

**1908.** Rəvayət edilir ki, Əbu Sələbə əl-Xuşəni ﷺ demişdir: "(Bir dəfə mən Peyğəmbərə ﷺ) dedim: "Ey Allahın peyğəmbəri! Biz Kitab əhlinin torpaqlarında yaşayırıq. Biz onların qablarında yemək yeyə bilərikmi? Habelə ov edilən bir diyarda yaşayıram. Hərdən yay və oxla, hərdən əhliləşdirilməmiş itimlə, hərdən də (ov üsulları ilə təlim edilib) əhliləşdirilmiş itimlə ov edirəm. Bunların hansını edə bilərəm? Peyğəmbər ﷺ buyurdu: "Kitab əhlinin qablarına gəlincə, əgər yemək-içmək üçün başqa qablar tapsanız, onların qablarında yemək yeməyin. Yox, əgər yemək-içmək üçün başqa qablar tapmasanız, onları yuduqdan sonra onlarda yemək yeyin. Allahın adını çəkib yayla ovladığın heyvanı yeyə bilərsən. Habelə, əhliləşdirilmiş itini ovun üstünə göndərdiyin zaman "bismillah" demisənsə, (ovladığın heyvanı) yeyə bilərsən. Əhliləşdirilməmiş itin gətirdiyi heyvanı boğazlamağa macal tapsan onu da yeyə bilərsən." (əl-Buxari, 5478)

## ٣– باب: الْخَذْفُ وَالْبُنْدُقَةُ

## 3-cü fəsil. Böyük və orta barmaqların ucu ilə daş ataraq, habelə içi boş çubuq vasitəsilə (qurudulmuş gil kürəcikləri ataraq) ov ovlamaq

١٩٠٩ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مُغَفَّلٍ ﷺ أَنَّهُ رَأَى رَجُلاً يَخْذِفُ فَقَالَ لَهُ لاَ تَخْذِفْ فَإِنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنِ الْخَذْفِ أَوْ كَانَ يَكْرَهُ الْخَذْفَ وَقَالَ إِنَّهُ لاَ يُصَادُ بِهِ صَيْدٌ وَلاَ يُنْكَى بِهِ عَدُوٌّ وَلَكِنَّهَا قَدْ تَكْسِرُ السِّنَّ وَتَفْقَأُ الْعَيْنَ ثُمَّ رَآهُ بَعْدَ ذَلِكَ يَخْذِفُ فَقَالَ لَهُ أُحَدِّثُكَ عَنْ رَسُولِ اللَّهِ ﷺ أَنَّهُ نَهَى عَنِ الْخَذْفِ أَوْ كَرِهَ الْخَذْفَ وَأَنْتَ تَخْذِفُ لاَ أُكَلِّمُكَ كَذَا وَكَذَا. [رواه البخاري: ٥٤٧٩]

**1909.** Rəvayət edilir ki, (bir dəfə) Abdullah ibn Muğəffəl ﷺ bir nəfərin barmaqlarının ucu ilə daş atıb heyvan ovladığını görüb dedi: "Bu cür daş atmaqla ov etmə! Çünki Peyğəmbər ﷺ bu üsulla ov etməyi qadağan etmiş (və ya bu cür ovlamağın əleyhinə olmuş) və demişdir: "Bu üsulla nə ov etmək, nə də düşmən öldürmək olar. Bununla sadəcə diş sındırmaq və göz çıxartmaq olar." Abdullah onun yenə daş atdığını görəndə dedi: "Mən sənə Peyğəmbərin ﷺ bu üsulla ov etməyin qadağan olunmasına dair hədisini rəvayət edirəm, sən isə öz bildiyini edirsən?! Mən səni filan vaxta qədər danışdırmayacağam." (əl-Buxari, 5479)

## ٤ – باب: مَنْ اقْتَنَى كَلْبًا لَيْسَ بِكَلْبِ صَيْدٍ أَوْ مَاشِيَةٍ

## 4-cü fəsil. Ov ovlamaq və ya mal-qaranı qorumaq üçün deyil, (başqa məqsədlə) it saxlamaq haqqında

١٩١٠ – عَنْ ابْنَ عُمَرَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ مَنْ اقْتَنَى كَلْبًا لَيْسَ بِكَلْبِ مَاشِيَةٍ أَوْ ضَارِيَةٍ نَقَصَ كُلَّ يَوْمٍ مِنْ عَمَلِهِ قِيرَاطَانِ. [رواه البخاري: ٥٤٨٠]

**1910.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mal-qaranı qorumaq, yaxud ov etmək üçün deyil, (başqa məqsədlə) it saxlayan kimsənin savabından hər gün iki qirat[1] azalır." (əl-Buxari, 5480)

[1] 44-cü hədisə bax.

## ٥– باب: الصَّيْدُ إِذَا غَابَ عَنْهُ يَوْمَيْنِ أَوْ ثَلاَثَةً

## 5-ci fəsil. Vurulmuş ov iki və ya üç gün tapılmazsa (nə etməli?)

١٩١١ – عَنْ عَدِيِّ بْنِ حَاتِمٍ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ إِذَا أَرْسَلْتَ كَلْبَكَ وَسَمَّيْتَ فَأَمْسَكَ وَقَتَلَ فَكُلْ وَإِنْ أَكَلَ فَلاَ تَأْكُلْ فَإِنَّمَا أَمْسَكَ عَلَى نَفْسِهِ وَإِذَا خَالَطَ كِلاَبًا لَمْ يُذْكَرْ اسْمُ اللَّهِ عَلَيْهَا فَأَمْسَكْنَ وَقَتَلْنَ فَلاَ تَأْكُلْ فَإِنَّكَ لاَ تَدْرِي أَيُّهَا قَتَلَ وَإِنْ رَمَيْتَ الصَّيْدَ فَوَجَدْتَهُ بَعْدَ يَوْمٍ أَوْ يَوْمَيْنِ لَيْسَ بِهِ إِلاَّ أَثَرُ سَهْمِكَ فَكُلْ وَإِنْ وَقَعَ فِي الْمَاءِ فَلاَ تَأْكُلْ. [رواه البخاري: ٥٤٨٤]

**1911.** Adiy ibn Hatim ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əgər "bismillah" deyib (ov) itini ovun üstünə qısqırtsan və o da ovu tutub gətirərsə, (ondan) yeyə bilərsən. Əgər it (həmin ovdan) yemişdirsə, sən (ondan) yemə. Çünki belə olduğu halda o bu ovu özü üçün ovlamış sayılır və əgər ov iti ilə üstündə Allahın adı çəkilməmiş itlər bir-birinə qarışsa və onlar ovu tutub gətirsələr, (bu ovdan) yemə. Çünki sən onlardan hansı birinin ovu yaxaladığını bilmirsən və əgər ovu (ox və s.) ilə vursan və onu bir, yaxud iki gündən sonra tapsan, üstündə də ox yarası görsən (ondan) yeyə bilərsən. Ov suya düşmüşdürsə, (ondan) yemə." (əl-Buxari, 5484)

## ٦– باب: أَكْلُ الْجَرَادِ

## 6-cı fəsil. Çəyirtkə yemək

١٩١٢ – عَنْ ابْنَ أَبِي أَوْفَى ﷺ قَالَ: غَزَوْنَا مَعَ النَّبِيِّ ﷺ سَبْعَ غَزَوَاتٍ أَوْ سِتًّا كُنَّا نَأْكُلُ مَعَهُ الْجَرَادَ. [رواه البخاري: ٥٤٩٤]

**1912.** Rəvayət edilir ki, ibn Əbu Əufə ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə yeddi, yaxud altı döyüşdə iştirak etmişik. (Həmin ərəfədə) biz çəyirtkə yeyirdik." (əl-Buxari, 5494)

## ٧– باب: النَّحْرُ وَالذَّبْحُ

## 7-ci fəsil. (Heyvanları) boğazlamaq və kəsmək

١٩١٣ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ﷺ قَالَتْ: نَحَرْنَا عَلَى عَهْدِ النَّبِيِّ ﷺ فَرَسًا فَأَكَلْنَاهُ. [رواه البخاري: ٥٥١١]

**1913.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr ﷺ demişdir: "Peyğəmbərin ﷺ zamanında biz at kəsib yedik." (əl-Buxari, 5511)

## ٨– باب: مَا يُكْرَهُ مِنْ الْمُثْلَةِ وَالْمَصْبُورَةِ وَالْمُجَثَّمَةِ

## 8-ci fəsil. Heyvanlar diri ikən onların əzalarını kəsməyin, habelə onlardan nişangah kimi istifadə etməyin qadağan olması

١٩١٤ – عَنْ ابْنِ عُمَرَ ﷺ أَنَّهُ مَرَّ بِنَفَرٍ نَصَبُوا دَجَاجَةً يَرْمُونَهَا فَلَمَّا رَأَوْا ابْنَ عُمَرَ تَفَرَّقُوا عَنْهَا وَقَالَ ابْنُ عُمَرَ مَنْ فَعَلَ هَذَا إِنَّ النَّبِيَّ ﷺ لَعَنَ مَنْ فَعَلَ هَذَا. [رواه البخاري: ٥٥١٥]

**1914.** Rəvayət edilir ki, (bir dəfə) ibn Ömər ﵄ toyuğu (diri-diri) asıb oxla vuran bir dəstə adamın yanından keçirdi. Onlar ibn Öməri görüb dərhal dağılışdılar. İbn Ömər dedi: "Bunu kim edib? Peyğəmbər ﷺ belə hərəkət edən kimsəni lənətləmişdir." (əl-Buxari, 5515)

**١٩١٥ –** عَنْ ابْنِ عُمَرَ ﵄ أَنَّهُ قَالَ: لَعَنَ النَّبِيُّ ﷺ مَنْ مَثَّلَ بِالْحَيَوَانِ [رواه البخاري: ٥٥١٥]

**1915.** Rəvayət edilir ki, ibn Ömər ﵄ demişdir: "Peyğəmbər ﷺ heyvanın diri-diri (hər hansı) bir əzasını kəsən adamı lənətləmişdir." (əl-Buxari, 5515)

## 9-cu fəsil. Toyuq əti

## ٩– باب: لَحْمُ الدَّجَاجِ

**١٩١٦ –** عَنْ أَبِي مُوسَى الأَشْعَرِيِّ ﵁ قَالَ: رَأَيْتُ النَّبِيَّ ﷺ يَأْكُلُ دَجَاجًا. [رواه البخاري: ٥٥١٧]

**1916.** Rəvayət edilir ki, Əbu Musa əl-Əşari ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ toyuq yediyini görmüşəm." (əl-Buxari, 5517)

## 10-cu fəsil. Yırtıcı heyvanların ətini yemək haqqında

## ١٠– باب: أَكْلُ كُلِّ ذِي نَابٍ مِنْ السِّبَاعِ

**١٩١٧ –** عَنْ أَبِي ثَعْلَبَةَ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ أَكْلِ كُلِّ ذِي نَابٍ مِنْ السِّبَاعِ. [رواه البخاري: ٥٥٣٠]

**1917.** Əbu Sələbə ﵁ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ istənilən yırtıcı heyvanı yeməyi qadağan etmişdir. (əl-Buxari, 6630)

## 11-ci fəsil. Müşk

## ١١– باب: الْمِسْكُ

**١٩١٨ –** عَنْ أَبِي مُوسَى ﵁ عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَثَلُ الْجَلِيسِ الصَّالِحِ وَالسَّوْءِ كَحَامِلِ الْمِسْكِ وَنَافِخِ الْكِيرِ فَحَامِلُ الْمِسْكِ إِمَّا أَنْ يُحْذِيَكَ وَإِمَّا أَنْ تَبْتَاعَ مِنْهُ وَإِمَّا أَنْ تَجِدَ مِنْهُ رِيحًا طَيِّبَةً وَنَافِخُ الْكِيرِ إِمَّا أَنْ يُحْرِقَ ثِيَابَكَ وَإِمَّا أَنْ تَجِدَ رِيحًا خَبِيثَةً. [رواه البخاري: ٥٥٣٤]

**1918.** Əbu Musa ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yaxşı dostla pis dostun məsəli ətir satanla körük vuranın məsəlinə bənzəyir. Ətir satana gəlincə, ya o sənə ətir bağışlar, ya sən ondan ətir alarsan, ya da ondan gözəl iy gəldiyini duyarsan. Körük vurana gəldikdə isə, ya o sənin paltarını yandırar, ya da ondan pis iy gəldiyini duyarsan." (əl-Buxari, 5534)

## 12-ci fəsil. Üzə damğa və nişan qoymaq haqqında

## ١٢– باب: الْوَسْمُ وَالْعَلَمُ فِي الصُّورَةِ

**١٩١٩ –** عَنْ ابْنِ عُمَرَ ﵄ قَالَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ تُضْرَبَ الصُّورَةُ. [رواه البخاري: ٥٥٤١]

**1919.** Rəvayət edilir ki, ibn Ömər ﵄ demişdir: "Peyğəmbər ﷺ üzə damğa vurmağı qadağan etmişdir." (əl-Buxari, 5541)

# ٧٣ – كِتَابُ الأَضَاحِي

# 73 – Qurbanlıqlar kitabı

## ١– باب: مَا يُؤْكَلُ مِنْ لُحُومِ الأَضَاحِيِّ وَمَا يُتَزَوَّدُ مِنْهَا

## 1-ci fəsil. Qurbanlıq heyvanların ətindən yemək və ehtiyat götürmək haqqında

١٩٢٠ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﵁ قَالَ: قَالَ النَّبِيُّ ﷺ مَنْ ضَحَّى مِنْكُمْ فَلاَ يُصْبِحَنَّ بَعْدَ ثَالِثَةٍ وَبَقِيَ فِي بَيْتِهِ مِنْهُ شَيْءٌ فَلَمَّا كَانَ الْعَامُ الْمُقْبِلُ قَالُوا يَا رَسُولَ اللَّهِ نَفْعَلُ كَمَا فَعَلْنَا عَامَ الْمَاضِي قَالَ كُلُوا وَأَطْعِمُوا وَادَّخِرُوا فَإِنَّ ذَلِكَ الْعَامَ كَانَ بِالنَّاسِ جَهْدٌ فَأَرَدْتُ أَنْ تُعِينُوا فِيهَا. [رواه البخاري: ٥٥٦٩]

**1920.** Sələmə ibn Əkva ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizlərdən kim qurban kəssə, (qoy bayramın) üçüncü gününün səhəri evində onun (ətindən) heç bir şey qalmasın." Növbəti il (bayram günü yetişdikdə əshabələr) dedilər: "Ya Rəsulullah, keçən ildəki kimi edəkmi?" Peyğəmbər ﷺ dedi: "Özünüz yeyin, (başqalarına) yedizdirin, üstəlik ehtiyatınızı da götürün. Belə ki, (keçən) il insanlara qıtlıq üz vermişdi, bu səbədən də mən sizin onlara yardım etməyinizi istədim." (əl-Buxari, 5569)

١٩٢١ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ ﵁ أَنَّهُ صَلَّى العِيْدَ يَوْمَ الأَضْحَى قَبْلَ الْخُطْبَةِ، ثُمَّ خَطَبَ فَقَالَ: يَا أَيُّهَا النَّاسُ إِنَّ رَسُولَ اللَّهِ ﷺ قَدْ نَهَاكُمْ عَنْ صِيَامِ هَذَيْنِ الْعِيدَيْنِ أَمَّا أَحَدُهُمَا فَيَوْمُ فِطْرِكُمْ مِنْ صِيَامِكُمْ وَأَمَّا الآخَرُ فَيَوْمٌ تَأْكُلُونَ مِنْ نُسُكِكُمْ. [رواه البخاري: ٥٥٧١]

**1921.** Rəvayət edilir ki, Ömər ibn Xəttab ﵁ Qurban bayramında xütbədən qabaq namaz qıldı, sonra (camaata) xitab edib dedi: "Ey insanlar! Həqiqətən, Peyğəmbər ﷺ sizə bu iki bayramda[1] oruc tutmağı qadağan etmişdir. Bunlardan biri orucunuzu tamamladığınız günün səhəri, digəri isə kəsdiyiniz qurbandan yediyiniz gündür." (əl-Buxari, 5571)

[1] Qurban və ramazan bayramları.

# ٧٤ – كِتَابُ الأَشْرِبَةِ

# 74 – İçkilər kitabı

## ١ – باب: قَوْلُهُ تَعَالَى:

﴿يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُوٓاْ إِنَّمَا ٱلْخَمْرُ وَٱلْمَيْسِرُ وَٱلْأَنصَابُ وَٱلْأَزْلَٰمُ رِجْسٌ مِّنْ عَمَلِ ٱلشَّيْطَٰنِ فَٱجْتَنِبُوهُ لَعَلَّكُمْ تُفْلِحُونَ﴾

## 1-ci fəsil. Uca Allah buyurur: “Ey iman gətirənlər! Şübhəsiz ki, sərxoşedici *içki* də, qumar da, *tapınmaq məqsədilə* dik qoyulmuş daşlar da, fal oxları da şeytan əməlindən olan murdar şeylərdir. Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız.”[1]

١٩٢٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: مَنْ شَرِبَ الْخَمْرَ فِي الدُّنْيَا ثُمَّ لَمْ يَتُبْ مِنْهَا حُرِمَهَا فِي الآخِرَةِ. [رواه البخاري: ٥٥٧٥]

**1922.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər kim bu dünyada şərab içər və tövbə etməzsə, axirətdə (içənlərə ləzzət verən) şərabdan[2] məhrum olar.” (əl-Buxari, 5575)

١٩٢٣ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه إِنَّ النَّبِيَّ ﷺ قَالَ: لاَ يَزْنِي الزَّانِي حِينَ يَزْنِي وَهُوَ مُؤْمِنٌ وَلا يَشْرَبُ الْخَمْرَ حِينَ يَشْرَبُهَا وَهُوَ مُؤْمِنٌ وَلاَ يَسْرِقُ السَّارِقُ حِينَ يَسْرِقُ وَهُوَ مُؤْمِنٌ. [رواه البخاري: ٥٥٧٨]

**1923.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Zina edən adam zina etdiyi vaxt mömin sayıla bilməz.[3] Şərab içən adam şərab içdiyi vaxt mömin sayıla bilməz. Oğurluq edən adam oğurluq etdiyi vaxt mömin sayıla bilməz.” (əl-Buxari, 5578)

١٩٢٤ – عَنْهُ فِي رِوَايَةٍ أَيْضاً: وَلاَ يَنْتَهِبُ نُهْبَةً ذَاتَ شَرَفٍ يَرْفَعُ النَّاسُ إِلَيْهِ أَبْصَارَهُمْ فِيهَا حِينَ يَنْتَهِبُهَا وَهُوَ مُؤْمِنٌ. [رواه البخاري: ٥٥٧٨]

**1924.** Əbu Hureyra رضي الله عنه rəvayət etdiyi digər hədisdə deyilmişdir: “....insanların gözü önündə (birisinin) dəyərli bir şeyini zor gücünə götürən adam onu götürdüyü vaxt mömin sayıla bilməz.” (əl-Buxari, 5578)

## ٢ – باب: الْخَمْرُ مِنْ الْعَسَلِ

## 2-ci fəsil. Baldan çəkilmiş şərab

١٩٢٥ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: سُئِلَ رَسُولُ اللَّهِ ﷺ عَنْ الْبِتْعِ وَهُوَ نَبِيذُ الْعَسَلِ وَكَانَ أَهْلُ الْيَمَنِ يَشْرَبُونَهُ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ كُلُّ شَرَابٍ أَسْكَرَ فَهُوَ حَرَامٌ. [رواه البخاري: ٥٥٨٥]

---

[1] “əl-Maidə” surəsi, 90.

[2] **“Müttəqilərə vəd olunan Cənnətin vəsfi belədir: orada xarab olmayan sudan çaylar, dadı dəyişməyən süddən çaylar, içənlərə ləzzət verən şərabdan çaylar və süzülmüş baldan çaylar vardır.”** “Muhəmməd” surəsi, 15.

[3] Burada söhbət möminin imanının kamilliyindən gedir. Belə ki, mömin bəndə hər dəfə günah işlətdikdə imanı bir qədər azalır.

**1925.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “(Bir dəfə) Peyğəmbərdən ﷺ yəmənlilərin içdiyi biti – baldan çəkilmiş şərab barəsində soruşdular. Peyğəmbər ﷺ dedi: “Hər bir sərxoşedici içki haram sayılır.” (əl-Buxari, 5585)

### 3-cü fəsil. Şərabı halal sayan və onu başqa adla adlandıran kimsə haqqında

### ٣- باب: مَا جَاءَ فِيمَنْ يَسْتَحِلُّ الْخَمْرَ وَيُسَمِّيهِ بِغَيْرِ اسْمِهِ

١٩٢٦ – عَنْ أَبِي عَامِرٍ الأَشْعَرِيِّ ﵁ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ: لَيَكُونَنَّ مِنْ أُمَّتِي أَقْوَامٌ يَسْتَحِلُّونَ الْحِرَ وَالْحَرِيرَ وَالْخَمْرَ وَالْمَعَازِفَ وَلَيَنْزِلَنَّ أَقْوَامٌ إِلَى جَنْبِ عَلَمٍ يَرُوحُ عَلَيْهِمْ بِسَارِحَةٍ لَهُمْ يَأْتِيهِمْ يَعْنِي الْفَقِيرَ لِحَاجَةٍ فَيَقُولُونَ ارْجِعْ إِلَيْنَا غَدًا فَيُبَيِّتُهُمُ اللَّهُ وَيَضَعُ الْعَلَمَ وَيَمْسَخُ آخَرِينَ قِرَدَةً وَخَنَازِيرَ إِلَى يَوْمِ الْقِيَامَةِ. [رواه البخاري: ٥٥٩٠]

**1926.** Əbu Amir əl-Əşari ﵁ rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: “Ümmətimdən elə adamlar meydana çıxacaq ki, onlar zina etməyi, ipək (geyməyi), şərab içməyi və musiqi alətlərindən istifadə etməyi halal sayacaqlar. Bəziləri də dağa yaxın (yerlərdə) yaşayacaqlar. (Çobanlar) bu adamların sürülərini sürüb onların yanına gətirəcək, habelə fağır-füqəra gəlib onlardan yardım istəyəcək və onlar: “Sabah gələrsən”– deyəcəklər. Gecə ikən Allah dağı onlardan bəzilərinin başına uçurdacaq, bəzilərini də meymunlara və donuzlara döndərəcək və onlar Qiyamət gününə qədər bu görkəmdə qalacaqlar.” (əl-Buxari, 5590)

### 4-cü fəsil. (Daş, mis və ya taxta) qablarda və camda (meyvə) şirəsi hazırlamaq

### ٤- باب: الانْتِبَاذُ فِي الأَوْعِيَةِ وَالتَّوْرِ

١٩٢٧ – عَنْ أَبِي أُسَيْدٍ السَّاعِدِيِّ ﵁ أَنَّهُ دَعَا رَسُولَ اللَّهِ ﷺ فِي عُرْسِهِ فَكَانَتْ امْرَأَتُهُ خَادِمَهُمْ وَهِيَ الْعَرُوسُ قَالَ أَتَدْرُونَ مَا سَقَيْتُ رَسُولَ اللَّهِ ﷺ أَنْقَعْتُ لَهُ تَمَرَاتٍ مِنَ اللَّيْلِ فِي تَوْرٍ. [رواه البخاري: ٥٥٩١]

**1927.** Əbu Useyd əs-Saidi ﵁ rəvayət edir ki, (evləndiyi gün) o, gedib Peyğəmbəri ﷺ öz toyuna dəvət etmişdi. Həmin gün onun zövcəsi gəlin ola-ola onlara xidmət edirdi. (Əbu Useyd) dedi: “Heç bilirsiniz o gün mən Peyğəmbərə ﷺ içməyə nə vermişdim?! Gecədən (taxta) qabın içində xurma isladıb şirəsini ona içirtdim.” (əl-Buxari, 5591)

### 5-ci fəsil. Peyğəmbər ﷺ bəzi qablardan istifadə etməyi qadağan etdikdən (bir müddət) sonra rüsxət vermişdir

### ٥- باب: تَرْخِيصُ النَّبِيِّ ﷺ فِي الأَوْعِيَةِ وَالظُّرُوفِ بَعْدَ النَّهْيِ

١٩٢٨ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﵄ قَالَ: لَمَّا نَهَى النَّبِيُّ ﷺ عَنْ الأَسْقِيَةِ قِيلَ لِلنَّبِيِّ ﷺ لَيْسَ كُلُّ النَّاسِ يَجِدُ سِقَاءً فَرَخَّصَ لَهُمْ فِي الْجَرِّ غَيْرِ الْمُزَفَّتِ. [رواه البخاري: ٥٥٩٣]

**1928.** Rəvayət edilir ki, Abdullah ibn Amr ﵄ demişdir: “Peyğəmbər ﷺ (şərab hazırlanan) qablardan istifadə etməyi qadağan etdikdə (bəziləri) Peyğəmbərə ﷺ dedilər: “Hər kəs (lazımi) qab tapa bilmir.” Bundan sonra Peyğəmbər ﷺ

(yan-yörəsinə) qatran sürtülməmiş cürdəklərdən istifadə etməyə rüsxət verdi." (əl-Buxari, 5593)

### ٦– باب: مَنْ رَأَى أَنْ لاَ يَخْلطَ الْبُسْرَ وَالتَّمْرَ إِذَا كَانَ مُسْكِرًا

### 6-cı fəsil. Yetişmiş və kal xurmalardan hazırlanmış içkini bir-birinə qarışdırmağı düzgün saymayan kimsə haqqında

١٩٢٩ – عَنْ أَبِي قَتَادَةَ ﷺ قَالَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ يُجْمَعَ بَيْنَ التَّمْرِ وَالزَّهْوِ وَالتَّمْرِ وَالزَّبِيبِ وَلْيُنْبَذْ كُلُّ وَاحِدٍ مِنْهُمَا عَلَى حِدَةٍ. [رواه البخاري: ٥٦٠٢]

**1929.** Rəvayət edilir ki, Əbu Qətadə ﷺ demişdir: "Peyğəmbər ﷺ yetişmiş xurma ilə kal xurmanı, habelə xurma ilə kişmişi qatışdırıb (şirə) çəkməyi qadağan etmişdir. Bunların hər birinin şirəsi ayrı-ayrı çəkilməlidir." (əl-Buxari, 5602)

### ٧– باب: شُرْبُ اللَّبَنِ وَ قَوْلُ اللهُ تَعَالَى: ﴿مِنۢ بَيۡنِ فَرۡثٖ وَدَمٖ لَّبَنًا خَالِصٗا سَآئِغٗا لِّلشَّٰرِبِينَ﴾

### 7-ci fəsil. Süd içmək. Uca Allah buyurur: "...Biz sizə, onların qarınlarındakı ifrazat və qan arasından çıxan, içənlərin boğazından rahat keçən təmiz süd içirdirik."[1]

١٩٣٠ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ قَالَ: جَاءَ أَبُو حُمَيْدٍ بِقَدَحٍ مِنْ لَبَنٍ مِنْ النَّقِيعِ فَقَالَ لَهُ رَسُولُ اللَّهِ ﷺ أَلاَّ خَمَّرْتَهُ وَلَوْ أَنْ تَعْرُضَ عَلَيْهِ عُودًا. [رواه البخاري: ٥٦٠٥]

**1930.** Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "(Bir dəfə) Əbu Humeyd ən-Nəqi deyilən yerdən[2] bir kasa süd gətirdi. Peyğəmbər ﷺ buyurdu: "(Kasanın) ağzına ağac parçası qoyub südün üstünü örtsəydin, yaxşı olardı?" (əl-Buxari, 5605)

١٩٣١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: نِعْمَ الصَّدَقَةُ اللِّقْحَةُ الصَّفِيُّ مِنْحَةً وَالشَّاةُ الصَّفِيُّ مِنْحَةً تَغْدُو بِإِنَاءٍ وَتَرُوحُ بِآخَرَ. [رواه البخاري: ٥٦٠٨]

**1931.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müvəqqəti olaraq südündən istifadə etmək üçün sağmal dəvə vermək, habelə səhər və axşam sağılan sağmal qoyun vermək nə gözəl sədəqədir!" (əl-Buxari, 5608)

### ٨– باب: شُرْبُ اللَّبَنِ بِالْمَاءِ

### 8-ci fəsil. Südü su ilə içmək

١٩٣٢ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ أَنَّ النَّبِيَّ ﷺ دَخَلَ عَلَى رَجُلٍ مِنْ الأَنْصَارِ وَمَعَهُ صَاحِبٌ لَهُ فَقَالَ لَهُ النَّبِيُّ ﷺ إِنْ كَانَ عِنْدَكَ مَاءٌ بَاتَ هَذِهِ اللَّيْلَةَ فِي شَنَّةٍ وَإِلاَّ كَرَعْنَا قَالَ وَالرَّجُلُ يُحَوِّلُ الْمَاءَ فِي حَائِطِهِ قَالَ فَقَالَ الرَّجُلُ يَا رَسُولَ اللَّهِ عِنْدِي مَاءٌ بَائِتٌ فَانْطَلِقْ إِلَى الْعَرِيشِ قَالَ فَانْطَلَقَ بِهِمَا فَسَكَبَ فِي قَدَحٍ ثُمَّ حَلَبَ عَلَيْهِ مِنْ دَاجِنٍ لَهُ قَالَ فَشَرِبَ رَسُولُ اللَّهِ ﷺ ثُمَّ شَرِبَ الرَّجُلُ الَّذِي جَاءَ مَعَهُ. [رواه البخاري: ٥٦١٣]

---

[1] "ən-Nəhl" surəsi, 66.
[2] Yəni otlayan qoyunların südündən.

**1932.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ əshabələrindən biri ilə birgə ənsardan olan bir nəfərin evinə daxil oldu və Peyğəmbər ﷺ ona dedi: "Əgər gecədən cürdəkdə qalmış su varsa, (gətir içək), yoxdursa, birbaşa hovuzdan içək." Bağçasını suvarmaqla məşğul olan bu adam (Peyğəmbərə ﷺ) dedi: "Ya Rəsulullah, gecədən qalmış suyum var, buyur keç çadıra!" (Ənsardan olan) bu adam onlarla bərabər çadıra girdi və bir kasa (götürüb içinə) su tökdü, sonra da qoyunlarından birinin südünü (həmin qabın) içinə sağdı. Beləliklə, əvvəlcə Peyğəmbər ﷺ, sonra da əshabə bundan içdi." (əl-Buxari, 5613)

### 9-cu fəsil. Ayaq üstə (su və s.) içmək

### ٩– باب: الشُّرْبُ قَائِمًا

١٩٣٣ – عَنْ عَلِيٍّ ﷺ أَنَّهُ أَتَى عَلَى بَابِ الرَّحَبَةِ فَشَرِبَ قَائِمًا فَقَالَ إِنَّ نَاسًا يَكْرَهُ أَحَدُهُمْ أَنْ يَشْرَبَ وَهُوَ قَائِمٌ وَإِنِّي رَأَيْتُ النَّبِيَّ ﷺ فَعَلَ كَمَا رَأَيْتُمُونِي فَعَلْتُ. [رواه البخاري: ٥٦١٥]

**1933.** Rəvayət edilir ki, Əli (ibn Əbu Talib) ﷺ (Kufə məscidindəki) Rəhəbə qapısının yanına gəlib orada ayaq üstə su içdi və dedi: "Camaat birisinin ayaq üstə su içməsini bəyənilməyən əməllərdən hesab edir. Halbuki, mən Peyğəmbərin ﷺ ayaq üstə su içdiyini görmüşəm." (əl-Buxari, 5615)

١٩٣٤ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: شَرِبَ النَّبِيُّ ﷺ قَائِمًا مِنْ زَمْزَمَ. [رواه البخاري: ٥٦١٧]

**1934.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "Peyğəməbər ﷺ Zəm-zəm suyundan ayaq üstə içmişdir." (əl-Buxari, 5617)

### 10-cu fəsil. (Su içəndə) tuluğun ağzını əymək

### ١٠– باب: اخْتِنَاثُ الأَسْقِيَةِ

١٩٣٥ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ قَالَ: نَهَى رَسُولُ اللَّهِ ﷺ عَنْ اخْتِنَاثِ الأَسْقِيَةِ. [رواه البخاري: ٥٦٢٥]

**1935.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Peyğəmbər ﷺ tuluğun ağzını əyib su içməyi[1] qadağan etmişdir." (əl-Buxari, 5625)

١٩٣٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ نَهَى رَسُولُ اللَّهِ ﷺ عَنْ الشُّرْبِ مِنْ فَمِ الْقِرْبَةِ أَوْ السِّقَاءِ وَأَنْ يَمْنَعَ جَارَهُ أَنْ يَغْرِزَ خَشَبَهُ فِي دَارِهِ. [رواه البخاري: ٥٦٢٧]

**1936.** Əbu Hureyra ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ tuluğun və ya cürdəyin ağzından bilavasitə su içməyi, habelə kimsənin öz qonşusuna evinin divarı dibində ağac əkməyə mane olmağını qadağan etmişdir. " (əl-Buxari, 5627)

### 11-ci fəsil. Qabın içinə üfürməyin qadağan olunması
### 12-ci fəsil. (Suyu və s.) iki və ya üç nəfəsə içmək

### ١١– باب: النَّهْيِ عَنْ التَّنَفُّسِ فِي الإِنَاءِ
### ١٢– باب: الشُّرْبِ بِنَفَسَيْنِ أَوْ ثَلاثَةٍ

١٩٣٧ – عَنْ أَنَسٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَتَنَفَّسُ ثَلاثًا. [رواه البخاري: ٥٦٣١]

[1] Yəni bilavasitə tuluğun ağzından su içmək.

**1937.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər (su içərkən) üç dəfə nəfəs alardı. (əl-Buxari, 5631)

## 13-cü fəsil. Gümüş qablar

## ١٣– باب: آنِيَةُ الْفِضَّةِ

١٩٣٨ – عَنْ أُمِّ سَلَمَةَ زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: الَّذِي يَشْرَبُ فِي إِنَاءِ الْفِضَّةِ إِنَّمَا يُجَرْجِرُ فِي بَطْنِهِ نَارَ جَهَنَّمَ. [رواه البخاري: ٥٦٣٤]

**1938.** Peyğəmbərin ﷺ zövcəsi Ummu Sələmə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Gümüş qabda su içən kimsələr, əslində, qarnına Cəhənnəm odu doldurur (və ya Qiyamət günü Cəhənnəm odu onun qarnında guruldayacaqdır)." (əl-Buxari, 5634)

## 14-cü fəsil. Qədəhdə (su və s.) içmək

## ١٤– باب: الشُّرْبُ فِي الأَقْدَاحِ

١٩٣٩ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﷺ قَالَ: جَاءَ النَّبِيُّ ﷺ سَقِيفَةَ بَنِي سَاعِدَةَ فَقَالَ: اسْقِنَا يَا سَهْلُ فَخَرَجْتُ لَهُمْ بِهَذَا الْقَدَحِ فَأَسْقَيْتُهُمْ فِيهِ فَأَخْرَجَ لَنَا سَهْلٌ ذَلِكَ الْقَدَحَ فَشَرِبْنَا مِنْهُ قَالَ ثُمَّ اسْتَوْهَبَهُ عُمَرُ بْنُ عَبْدِ الْعَزِيزِ بَعْدَ ذَلِكَ فَوَهَبَهُ لَهُ. [رواه البخاري: ٥٦٣٧]

**1939.** Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ Bəni Saidə talvarının yanına gəlib dedi: "Bizə su ver, ey Səhl!"- dedi. Onda mən bu camda su çıxardıb onlara verdim."

(Hədisi danışan ravi) demişdir: "Sonra Səhl ﷺ bizim üçün həmin qabı çıxartdı və biz o qabdan su içdik. Bundan sonra isə Ömər ibn Abdul-Əziz Səhldən bu camı ona bağışlamağı xahiş etdi, o da qabı Ömərə bağışladı." (əl-Buxari, 5637)

١٩٤٠ – عَنْ عَاصِمٍ الأَحْوَلِ ﷺ قَالَ: رَأَيْتُ قَدَحَ النَّبِيِّ ﷺ عِنْدَ أَنَسِ بْنِ مَالِكٍ وَكَانَ قَدِ انْصَدَعَ فَسَلْسَلَهُ بِفِضَّةٍ قَالَ وَهُوَ قَدَحٌ جَيِّدٌ عَرِيضٌ مِنْ نُضَارٍ قَالَ: قَالَ أَنَسٌ لَقَدْ سَقَيْتُ رَسُولَ اللَّهِ ﷺ فِي هَذَا الْقَدَحِ أَكْثَرَ مِنْ كَذَا وَكَذَا قَالَ وَقَالَ ابْنُ سِيرِينَ إِنَّهُ كَانَ فِيهِ حَلْقَةٌ مِنْ حَدِيدٍ فَأَرَادَ أَنَسٌ أَنْ يَجْعَلَ مَكَانَهَا حَلْقَةً مِنْ ذَهَبٍ أَوْ فِضَّةٍ فَقَالَ لَهُ أَبُو طَلْحَةَ لاَ تُغَيِّرَنَّ شَيْئًا صَنَعَهُ رَسُولُ اللَّهِ ﷺ فَتَرَكَهُ. [رواه البخاري: ٥٦٣٨]

**1940.** Rəvayət edilir ki, Asim əl-Əhvəl demişdir: "Mən Peyğəmbərin ﷺ piyaləsini Ənəs ibn Malikdə gördüm. Bu cam çatlamış, o da onu gümüş lehimlə[1] birləşdirmişdi. Bu, nudar ağacından düzəldilmiş enli bir piyalə idi." Ənəs dedi: "Mən bu piyalədə Peyğəmbərə ﷺ filan qədər su vermişəm."

İbn Sirin demişdir: "Həmin piyalənin dəmirdən həlqəsi var idi. Ənəs onu qızıl və ya gümüş həlqə ilə dəyişdirmək istədikdə Əbu Təlhə ona: "Peyğəmbərin ﷺ düzəltdiyi bir şeyi dəyişdirmə"– dedi, o da onu olduğu kimi saxladı." (əl-Buxari, 5638)

---

[1] 1319-cu hədisə və onun qeydlərinə bax.

# ٧٥ – كِتَابُ الْمَرْضَى

# 75 – Xəstələr kitabı

## ١ – باب: مَا جَاءَ فِي كَفَّارَةِ الْمَرَضِ وَقَوْلُ اللَّهِ تَعَالَى: ﴿مَن يَعْمَلْ سُوءًا يُجْزَ بِهِ﴾

## 1-ci fəsil. Xəstələrin kəffarəsi barədə deyilənlər. Uca Allah buyurur: "...Pislik edən kəs, onun cəzasını alacaq..."[1]

١٩٤١ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ وَعَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنهما عَنِ النَّبِيِّ ﷺ قَالَ: مَا يُصِيبُ الْمُسْلِمَ مِنْ نَصَبٍ وَلاَ وَصَبٍ وَلاَ هَمٍّ وَلاَ حُزْنٍ وَلاَ أَذًى وَلاَ غَمٍّ حَتَّى الشَّوْكَةِ يُشَاكُهَا إِلاَّ كَفَّرَ اللَّهُ بِهَا مِنْ خَطَايَاهُ. [رواه البخاري: ٥٦٤١-٥٦٤٢]

**1941.** Əbu Səid əl-Xudri və Əbu Hureyra ﷺ rəvayət edirlər ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlmana üz vermiş elə bir yorğunluq, elə bir naxoşluq, elə bir kədər, elə bir üzüntü, elə bir əziyyət, elə bir dərd, hətta (ayağına) batan elə bir tikan yoxdur ki, onun sayəsində Allah (həmin) müsəlmanın günahlarını bağışlamasın." (əl-Buxari, 5642)

١٩٤٢ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: مَثَلُ الْمُؤْمِنِ كَمَثَلِ الْخَامَةِ مِنَ الزَّرْعِ مِنْ حَيْثُ أَتَتْهَا الرِّيحُ كَفَأَتْهَا فَإِذَا اعْتَدَلَتْ تَكَفَّأُ بِالْبَلاَءِ وَالْفَاجِرُ كَالأَرْزَةِ صَمَّاءَ مُعْتَدِلَةً حَتَّى يَقْصِمَهَا اللَّهُ إِذَا شَاءَ. [رواه البخاري: ٥٦٤٤]

**1942.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mömin pöhrəyə[2] bənzəyir. Külək hansı tərəfdən əssə, pöhrəni əyər, külək sakitləşdiyi zaman pöhrə dikələr. (Mömin də həmçinin,) müsibətlərə məruz qalsa da (əqidəsindən dönmür). Günahkar adam isə sərt və dümdüz qalan sidr ağacına bənzəyir. Yalnız Allah istəsə, onu sındıra bilər." (əl-Buxari, 5644)

١٩٤٣ – عَنْ أَبِي هُرَيْرَةَ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ مَنْ يُرِدْ اللَّهُ بِهِ خَيْرًا يُصِبْ مِنْهُ. [رواه البخاري: ٥٦٤٥]

**1943.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah kimə xeyir nəsib etmək istəsə, onu imtahana çəkər." (əl-Buxari, 5645)

## ٢ – باب: شِدَّةُ الْمَرَضِ

## 2-ci fəsil. Xəstəliyin şiddəti

١٩٤٤ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: مَا رَأَيْتُ أَحَدًا أَشَدَّ عَلَيْهِ الْوَجَعُ مِنْ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٥٦٤٦]

**1944.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən Peyğəmbər ﷺ qədər ağrılardan əziyyət çəkən bir adam görməmişəm." (əl-Buxari, 5646)

١٩٤٥ – عَنْ عَبْدِ اللَّهِ رضي الله عنه أَتَيْتُ النَّبِيَّ ﷺ فِي مَرَضِهِ وَهُوَ يُوعَكُ وَعْكًا شَدِيدًا وَقُلْتُ إِنَّكَ لَتُوعَكُ وَعْكًا شَدِيدًا قُلْتُ إِنَّ ذَاكَ بِأَنَّ لَكَ أَجْرَيْنِ قَالَ أَجَلْ مَا مِنْ مُسْلِمٍ يُصِيبُهُ أَذًى إِلاَّ حَاتَّ اللَّهُ عَنْهُ خَطَايَاهُ كَمَا تَحَاتُّ وَرَقُ الشَّجَرِ. [رواه البخاري: ٥٦٤٧]

---

[1] "ən-Nisa" surəsi, 123.

[2] Ağacda və başqa bitkilərdə yenicə cücərən göy qabıqlı incə budaqların hər biri; zoğ.

**1945.** Rəvayət edilir ki, Abdullah (ibn Məsud) ﷺ demişdir: "Peyğəmbər ﷺ (ağır) xəstələndiyi zaman mən onun yanına gəldim (və baxdım ki,) o, qızdırma içində yanır. Dedim: "(Ya Rəsulullah,) sən qızdırma içində yanırsan! Yəqin bu, sənin iki savab qazanmağın üçündür?" O dedi: "Düzdür, başına müsibət gəlmiş elə bir müsəlman yoxdur ki, Allah, ağacın yarpaqları töküldüyü kimi, onu günahlardan təmizləmiş olmasın." (əl-Buxari, 5647)

## ٣– باب: فَضْلُ مَنْ يُصْرَعُ مِنْ الرِّيحِ

## 3-cü fəsil. Epilepsiyadan[1] əziyyət çəkən kimsənin üstünlüyü

١٩٤٦ – عَنْ عَطَاءَ بْنِ أَبِي رَبَاحٍ قَالَ: قَالَ لِي ابْنُ عَبَّاسٍ رضي الله عنهما أَلاَ أُرِيكَ امْرَأَةً مِنْ أَهْلِ الْجَنَّةِ قُلْتُ بَلَى قَالَ هَذِهِ الْمَرْأَةُ السَّوْدَاءُ أَتَتْ النَّبِيَّ ﷺ فَقَالَتْ إِنِّي أُصْرَعُ وَإِنِّي أَتَكَشَّفُ فَادْعُ اللَّهَ لِي قَالَ إِنْ شِئْتِ صَبَرْتِ وَلَكِ الْجَنَّةُ وَإِنْ شِئْتِ دَعَوْتُ اللَّهَ أَنْ يُعَافِيَكِ فَقَالَتْ أَصْبِرُ فَقَالَتْ إِنِّي أَتَكَشَّفُ فَادْعُ اللَّهَ لِي أَنْ لاَ أَتَكَشَّفَ فَدَعَا لَهَا. [رواه البخاري: ٥٦٥٢]

**1946.** Rəvayət edilir ki, Əta ibn Əbu Rəbah demişdir: "(Bir dəfə) ibn Abbas mənə dedi: "Sənə Cənnət əhlindən olan bir qadın göstərimmi?" Mən: "Göstər"- dedim. İbn Abbas dedi: "Bu, zənci qadın (bir zaman) Peyğəmbərin ﷺ yanına gəlib demişdi: "(Ya Rəsulullah,) mən (bəzən) bayılıram və üstüm-başım açılır. Mənim üçün Allaha dua et!" Peyğəmbər ﷺ buyurdu: "İstəyirsən səbir et, sənə Cənnət nəsib olsun, istəyirsənsə, dua edim, Allah sənə can sağlığı versin." Qadın dedi: "Mən səbir edərəm, amma mənim üstüm açılır. Allaha dua et ki, üstüm açılmasın." Peyğəmbər ﷺ də onun üçün dua etdi." (əl-Buxari, 5652)

## ٤– باب: فَضْلُ مَنْ ذَهَبَ بَصَرُهُ

## 4-cü fəsil. Gözləri tutulmuş kimsənin üstünlüyü

١٩٤٧ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: إِنَّ اللَّهَ قَالَ إِذَا ابْتَلَيْتُ عَبْدِي بِحَبِيبَتَيْهِ فَصَبَرَ عَوَّضْتُهُ مِنْهُمَا الْجَنَّةَ يُرِيدُ عَيْنَيْهِ. [رواه البخاري: ٥٦٥٣]

**1947.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Uca Allah buyurmuşdur: "Əgər Mən Öz qulumu onun sevdiyi iki şeylə imtahana çəksəm, bunun əvəzində ona Cənnət bəxş edərəm."
Allah "sevdiyi iki şeylə" deyəndə gözləri qəsd edirdi." (əl-Buxari, 5653)

## ٥– باب: عِيَادَةُ الْمَرِيضِ

## 5-ci fəsil. Xəstəyə baş çəkmək

١٩٤٨ – عَنْ جَابِرٍ رضي الله عنه قَالَ: جَاءَنِي النَّبِيُّ ﷺ يَعُودُنِي لَيْسَ بِرَاكِبِ بَغْلٍ وَلاَ بِرْذَوْنٍ. [رواه البخاري: ٥٦٦٤]

[1] Vaxtaşırı və qəflətən bərk qıcolma və özündəngetmə şəklində cərəyan edən xroniki sinir xəstəliyi.

**1948.** Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "(Mən xəstə ikən) Peyğəmbər mənə baş çəkməyə gəldi. Həmin vaxt o nə qatıra, nə də ata minmişdi." (əl-Buxari, 5664)

### ٦– باب: قَوْلُ الْمَرِيضِ إِنِّي وَجِعٌ أَوْ وَا رَأْسَاهْ أَوْ اشْتَدَّ بِي الْوَجَعُ وَقَوْلُ أَيُّوبَ ﵇: ﴿أَنِّي مَسَّنِيَ ٱلضُّرُّ وَأَنتَ أَرۡحَمُ ٱلرَّٰحِمِينَ﴾

### 6-cı fəsil. Xəstənin: "mən ağrıyıram", "vay başım" və ya "vəziyyətim ağırlaşır" deməsi. Əyyub ﵇ demişdir: "Mənə, həqiqətən də, bəla düçar olubdur. Sən rəhmlilərin ən rəhmlisisən!"[1]

١٩٤٩ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: وَا رَأْسَاهْ فَقَالَ رَسُولُ اللَّه ﷺ ذَاك لَوْ كَانَ وَأَنَا حَيٌّ فَأَسْتَغْفرَ لَك وَأَدْعُوَ لَك فَقَالَتْ عَائشَةُ وَا ثُكْلِيَاهْ وَاللَّه إِنِّي لأَظُنُّكَ تُحبُّ مَوْتي وَلَوْ كَانَ ذَاكَ لَظَلَلْتَ آخرَ يَوْمكَ مُعَرِّسًا ببَعْضِ أَزْوَاجكَ فَقَالَ النَّبيُّ ﷺ بَلْ أَنَا وَا رَأْسَاهْ لَقَدْ هَمَمْتُ أَوْ أَرَدْتُ أَنْ أُرْسلَ إِلَى أَبِي بَكْرٍ وَابْنه وَأَعْهَدَ أَنْ يَقُولَ الْقَائلُونَ أَوْ يَتَمَنَّى الْمُتَمَنُّونَ ثُمَّ قُلْتُ يَأْبَى اللَّهُ وَيَدْفَعُ الْمُؤْمِنُونَ أَوْ يَدْفَعُ اللَّهُ وَيَأْبَى الْمُؤْمِنُونَ. [رواه البخاري: ٥٦٦٥]

**1949.** Rəvayət edilir ki, (bir dəfə) Aişə ﵂ (başı bərk ağrıdığından): "Vay başım!"– dedi. (Bunu eşidəndə) Peyğəmbər ﷺ buyurdu: "Əgər mən həyatda ikən sənə bir şey olsa, mən sənin üçün bağışlanma dilərəm və sənin üçün dua edərəm." Aişə dedi: "Vay mənim halıma! Deyəsən sən mənim ölməyimi istəyirsən. Əgər mənə bir şey olsa, sən ömrünün qalan günlərini digər zövcələrinin yanında keçirəcəksən." Peyğəmbər ﷺ buyurdu: "Xeyr, vay mənim başıma![2] Camaat heç nə deməsin və heç bir şey istəməsin deyə, mən Əbu Bəkri və onun oğlunu yerimə vəliəhd təyin etmək istədim. Sonra fikirləşdim ki, Allah (Əbu Bəkrdən qeyrisini) qəbul etməz, möminlər də (başqa birisini) dəf edərlər, yaxud Allah (qeyrisini) dəf edər, möminlər də (başqa birisini) qəbul etməzlər." (əl-Buxari, 5665)

### ٧– باب: تَمَنِّي الْمَرِيضِ الْمَوْتَ

### 7-ci fəsil. Xəstənin özünə ölüm diləməsi haqqında

١٩٥٠ – عَنْ أَنَسِ بْنِ مَالك ﵁ قَالَ: النَّبيُّ ﷺ لاَ يَتَمَنَّيَنَّ أَحَدُكُمْ الْمَوْتَ منْ ضُرٍّ أَصَابَهُ فَإِنْ كَانَ لاَ بُدَّ فَاعلاً فَلْيَقُلْ اللَّهُمَّ أَحْيِنِي مَا كَانَتْ الْحَيَاةُ خَيْرًا لِي وَتَوَفَّنِي إِذَا كَانَتْ الْوَفَاةُ خَيْرًا لِي. [رواه البخاري: ٥٦٧١]

**1950.** Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər demişdir: "Sizdən heç kəs başına gəlmiş bir müsibətə görə özünə ölüm diləməsin! Əgər çıxılmaz vəziyyətdə qalarsa, qoy desin: "Allahummə, əhyini mə kanətil-hayətu xeyran li və təvaffəni izə kanətil-vəfatu xeyran li.[3]" (əl-Buxari, 5671)

[1] "əl-Ənbiya" surəsi, 83.
[2] Burada Peyğəmbər ﷺ ondan əvvəl dünyadan köçəcəyini qəsd edir.
[3] Tərcüməsi: Allahım, bu həyatda yaşamağım mənim üçün xeyirlidirsə, məni yaşat, yox, ölümüm mənim üçün xeyirlidirsə, onda məni öldür!

١٩٥١ – عَنْ خَبَّاب ﷺ أَنَّهُ اكْتَوَى سَبْعَ كَيَّات فَقَالَ: إِنَّ أَصْحَابَنَا الَّذينَ سَلَفُوا مَضَوْا وَلَمْ تَنْقُصْهُمُ الدُّنْيَا وَإِنَّا أَصَبْنَا مَا لاَ نَجدُ لَهُ مَوْضعًا إِلاَّ التُّرَابَ وَلَوْلاَ أَنَّ النَّبِيَّ ﷺ نَهَانَا أَنْ نَدْعُوَ بِالْمَوْتِ لَدَعَوْتُ بِه. [رواه البخاري: ٥٦٧٢]

**1951.** Rəvayət edilir ki, (bir dəfə xəstəlikdən dolayı) Xəbbabın ﷺ (bədəninə) yeddi dəfə dağ basıldıqdan sonra o dedi: "Bizdən əvvəl həyatla vidalaşmış qardaşlarımıza gəlincə, bu dünya onların (axirət mükafatlarından) heç bir şey əksiltməmişdi. Biz isə əlimizdə olan imkanları torpağa xərcləməkdən başqa bir şey bilmirik. Əgər Peyğəmbər ﷺ bizə ölüm diləməyi qadağan etməsəydi, özümə ölüm diləyərdim."[1] (əl-Buxari, 5672)

١٩٥٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمعْتُ رَسُولَ اللَّه ﷺ يَقُولُ لَنْ يُدْخلَ أَحَدًا عَمَلُهُ الْجَنَّةَ قَالُوا وَلاَ أَنْتَ يَا رَسُولَ اللَّه قَالَ: لاَ وَلاَ أَنَا إِلاَّ أَنْ يَتَغَمَّدَنِي اللَّهُ بِفَضْلٍ وَرَحْمَة فَسَدِّدُوا وَقَارِبُوا وَلاَ يَتَمَنَّيَنَّ أَحَدُكُمُ الْمَوْتَ إِمَّا مُحْسِنًا فَلَعَلَّهُ أَنْ يَزْدَادَ خَيْرًا وَإِمَّا مُسِيئًا فَلَعَلَّهُ أَنْ يَسْتَعْتِبَ. [رواه البخاري: ٥٦٧٣]

**1952.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Heç bir kəsi əməlləri Cənnətə daxil edə bilməz." (Əshabələr): "Səni də, ya Rəsulullah?"– deyə soruşdular. Dedi: "Hətta məni də. Yalnız Allahın mənə mərhəmət göstərməsi və mənə rəhm etməsi istisnadır. Elə isə doğru yol tutun, (ən kamil olanı yerinə yetirə bilməsəniz, heç olmasa ona) yaxınlaşın! Sizdən heç kəs özünə ölüm diləməsin. (Əgər o, həyatda qalarsa,) əməlisaleh adamdırsa, yaxşı işlər görüb savabını artırar, yox günahkar adamdırsa, ola bilər ki, tövbə etsin." (əl-Buxari, 5673)

## 8-ci fəsil. Xəstəyə baş çəkən kimsənin ona dua etməsi

## ٨– باب: دُعَاءُ الْعَائد للْمَرِيضِ

١٩٥٣ – عَنْ عَائشَةَ ﷺ أَنَّ رَسُولَ اللَّه ﷺ كَانَ إِذَا أَتَى مَرِيضًا أَوْ أُتِيَ بِه قَالَ أَذْهِبْ الْبَاسَ رَبَّ النَّاسِ اشْفِ وَأَنْتَ الشَّافِي لاَ شِفَاءَ إِلاَّ شِفَاؤُكَ شِفَاءً لاَ يُغَادِرُ سَقَمًا. [رواه البخاري: ٥٦٧٥]

**1953.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ xəstəni ziyarət etdikdə və ya onun yanına xəstə gətirildikdə (onun üçün dua edib) deyərdi: "Əzhibil-bəs, Rabbən-nas, işfi və əntəş-Şafi,[2] lə şifaə ilə şifaukə, şifaən lə yuğadiru səqəmən."[3] (əl-Buxari, 5675)

---

[1] Hədisin davamında deyilir: "...Bir müddətdən sonra biz yenə ona baş çəkməyə getdik və gəlib gördük ki, o, evinin divarını tikir. (Xəbbab bizi görəndə) dedi: "Müsəlman bəndə (ehtiyacından əlavə) torpağa qoyduğu xərcdən başqa xərclədiyi hər bir şeyə görə savab qazanır."

[2] əş-Şafi: Allahın adlarından biridir.

[3] Tərcüməsi: Ey insanların Rəbbi, bu xəstəliyi aradan qaldır və şəfa ver. Sənsən Şəfa verən! Sənin verdiyin şəfadan başqa şəfa yoxdur. (Ona) elə bir şəfa ver ki, bundan sonra heç bir xəstəlik qalmasın.

# ٧٦ – كِتَابُ الطِّبِّ

# 76 – Tibb kitabı

## 1-ci fəsil. Allah elə bir xəstəlik nazil etməmişdir ki, onun şəfasını nazil etmiş olmasın

## ١ – باب: مَا أَنْزَلَ اللَّهُ دَاءً إِلاَّ أَنْزَلَ لَهُ شِفَاءً

١٩٥٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ مَا أَنْزَلَ اللَّهُ دَاءً إِلاَّ أَنْزَلَ لَهُ شِفَاءً. [رواه البخاري: ٥٦٧٨]

**1954.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah elə bir xəstəlik nazil etməmişdir ki, onun şəfasını nazil etmiş olmasın." (əl-Buxari, 5678)

## 2-ci fəsil. Üç şeydə şəfa vardır

## ٢– باب: الشِّفَاءُ فِي ثَلاَثٍ

١٩٥٥ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ قَالَ: الشِّفَاءُ فِي ثَلاَثَةٍ شَرْبَةِ عَسَلٍ وَشَرْطَةِ مِحْجَمٍ وَكَيَّةِ نَارٍ وَأَنْهَى أُمَّتِي عَنِ الْكَيِّ. [رواه البخاري: ٥٦٨١]

**1955.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "Üç şeydə şəfa vardır: bir içim balda, (qan almaq üçün) banka qoymaqda və (müalicə məqsədilə bədənə) dağ basmaqda. (Buna rəğmən) mən ümmətimə dağ basmağı qadağan edirəm." (əl-Buxari, 5681)

## 3-cü fəsil. Bal ilə müalicə olunmaq. Uca Allah buyurur: "*O arıların* qarınlarından tərkibində insanlar üçün şəfa olan müxtəlif rəngli bal çıxır."[1]

## ٣– باب: الدَّوَاءُ بِالْعَسَلِ وَقَوْلُ اللَّهِ تَعَالَى: ﴿فِيهِ شِفَآءٌ لِّلنَّاسِ﴾

١٩٥٦ – عَنْ أَبِي سَعِيدٍ ﷺ أَنَّ رَجُلاً أَتَى النَّبِيَّ ﷺ فَقَالَ أَخِي يَشْتَكِي بَطْنَهُ فَقَالَ اسْقِهِ عَسَلاً ثُمَّ أَتَى الثَّانِيَةَ فَقَالَ اسْقِهِ عَسَلاً ثُمَّ أَتَاهُ الثَّالِثَةَ فَقَالَ اسْقِهِ عَسَلاً ثُمَّ أَتَاهُ فَقَالَ قَدْ فَعَلْتُ فَقَالَ صَدَقَ اللَّهُ وَكَذَبَ بَطْنُ أَخِيكَ اسْقِهِ عَسَلاً فَسَقَاهُ فَبَرَأَ. [رواه البخاري: ٥٦٨٤]

**1956.** Əbu Səid ﷺ rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Qardaşımın qarnı bərk ağrıyır." Peyğəmbər ﷺ: "Ona bal içirt!"- dedi. (Çox keçmədən) həmin adam bir də Peyğəmbərin ﷺ yanına gəldi və Peyğəmbər ﷺ (yenə): "Ona bal içirt!"– dedi. Adam üçüncü kərə Peyğəmbərin ﷺ yanına gəldi və o (bu dəfə də): "Ona bal içirt!"– dedi. Axırda həmin adam dedi: "Mən sən deyəni elədim, (amma onun qarnının ağrısı kəsmədi ki, kəsmədi)." Peyğəmbər ﷺ buyurdu: "Allah doğru söylədi, qardaşının qarnı isə

[1] "ən-Nəhl" surəsi, 69.

yalançı çıxdı. (Sən yenə) ona bal içirt." Bundan sonra o, (qardaşına) bal içirtdi və qardaşı sağaldı." (əl-Buxari, 5684)

## 4-cü fəsil. Qara zirə[1]

## ٤ – باب: الْحَبَّةُ السَّوْدَاءُ

١٩٥٧ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: إِنَّ هَذِهِ الْحَبَّةَ السَّوْدَاءَ شِفَاءٌ مِنْ كُلِّ دَاءٍ إِلاَّ مِنَ السَّامِ قُلْتُ وَمَا السَّامُ قَالَ الْمَوْتُ. [رواه البخاري: ٥٦٨٧]

**1957.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Bu qara zirə samdan başqa hər bir xəstəliyin dərmanıdır." Mən: "Sam nədir?"– deyə soruşdum. O: "Ölümdür!"– dedi." (əl-Buxari, 5687)

## 5-ci fəsil. Hind və dəniz qustundan[2] hazırlanmış məlhəmi buruna damızdırmaq

## ٥ – باب: السَّعُوطُ بِالْقُسْطِ الْهِنْدِيِّ وَالْبَحْرِيِّ

١٩٥٨ – عَنْ أُمِّ قَيْسٍ بِنْتِ مِحْصَنٍ رضي الله عنها قَالَتْ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: عَلَيْكُمْ بِهَذَا الْعُودِ الْهِنْدِيِّ فَإِنَّ فِيهِ سَبْعَةَ أَشْفِيَةٍ يُسْتَعَطُ بِهِ مِنَ الْعُذْرَةِ وَيُلَدُّ بِهِ مِنْ ذَاتِ الْجَنْبِ. [رواه البخاري: ٥٦٩٢]

**1958.** Rəvayət edilir ki, Ummu Qeys bint Mihsən رضي الله عنها demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Bu hind qustundan istifadə edin. Həqiqətən də, onda yeddi (xəstəliyin) şəfası vardır. Onun məlhəmindən boğazı xəstə olanın boğazına, plevritə[3] tutulanın ağzına damızdırın." (əl-Buxari, 5692)

## 6-cı fəsil. Qan alma[4] yolu ilə müalicə olunmaq

## ٦ – باب: الْحِجَامَةُ مِنَ الدَّاءِ

١٩٥٩ – عَنْ أَنَسٍ رضي الله عنه أَنَّهُ سُئِلَ عَنْ أَجْرِ الْحَجَّامِ فَقَالَ: احْتَجَمَ رَسُولُ اللَّهِ ﷺ حَجَمَهُ أَبُو طَيْبَةَ وَأَعْطَاهُ صَاعَيْنِ مِنْ طَعَامٍ وَكَلَّمَ مَوَالِيَهُ فَخَفَّفُوا عَنْهُ وَقَالَ: إِنَّ أَمْثَلَ مَا تَدَاوَيْتُمْ بِهِ الْحِجَامَةُ وَالْقُسْطُ الْبَحْرِيُّ. وَقَالَ لاَ تُعَذِّبُوا صِبْيَانَكُمْ بِالْغَمْزِ مِنَ الْعُذْرَةِ وَعَلَيْكُمْ بِالْقُسْطِ. [رواه البخاري: ٥٦٩٦]

**1959.** Rəvayət edilir ki, (bir dəfə) Ənəsdən رضي الله عنه həcəmət[5] qoyan adamın qazancı barədə soruşdular. Dedi: "(Bir vaxt) Əbu Teybə Peyğəmbərdən ﷺ qan aldı və Peyğəmbər ﷺ ona iki saa[6] yemək verdi, üstəlik onun ağaları ilə danışdı və onlar (gündəlik olaraq ondan aldıqları xəracın miqdarını) bir qədər azaltdılar."

---

[1] Buna çörəkotu da deyilir: çətir fəsiləsindən bir bitki və həmin bitkinin ədviyyat kimi xəmirə və s.-yə qatılan xoşiyli toxumu.

[2] Qust: dərman bitkisidir. Hindistan qustu qara rəngdə, dəniz qustu isə ağ rəngdə olur.

[3] 10-cu fəsilə və 1963-cü hədisə bax.

[4] 997-ci hədisə və onun qeydlərinə bax.

[5] Müalicə məqsədilə baş, kürək və bədənin başqa nahiyələrindən qan almaq üçün işlədilən buynuzşəkilli alət.

[6] 152-ci hədisin qeydlərinə bax.

(Peyğəmbər ﷺ) demişdir: “Müalicə olunmağınız üçün istifadə etdiyiniz ən gözəl şey həcəmət və dənis qustudur.”

Həmçinin demişdir: “Uşaqlarınızın (şişmiş) badamcıq vəzilərini[1] (barmaqla) basaraq onlara əzab-əziyyət verməyin. Onları qustla müalicə edin.” (əl-Buxari, 5696)

## 7-ci fəsil. Özünə və ya başqa birisinə dağ basmaqla müalicə edən kimsə haqqında, habelə bu yolla müalicə etməyən kimsənin üstünlüyü

## ٧– باب: مَنْ اكْتَوَى أَوْ كَوَى غَيْرَهُ وَفَضْلُ مَنْ لَمْ يَكْتَوِ

**١٩٦٠** – عَنْ ابْنُ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ عُرِضَتْ عَلَيَّ الأُمَمُ فَجَعَلَ النَّبِيُّ وَالنَّبِيَّان يَمُرُّونَ مَعَهُمْ الرَّهْطُ وَالنَّبِيُّ لَيْسَ مَعَهُ أَحَدٌ حَتَّى رُفِعَ لِي سَوَادٌ عَظِيمٌ قُلْتُ مَا هَذَا أُمَّتِي هَذِهِ قِيلَ بَلْ هَذَا مُوسَى وَقَوْمُهُ قِيلَ انْظُرْ إِلَى الأُفُقِ فَإِذَا سَوَادٌ يَمْلأُ الأُفُقَ ثُمَّ قِيلَ لِي انْظُرْ هَا هُنَا وَهَا هُنَا فِي آفَاقِ السَّمَاءِ فَإِذَا سَوَادٌ قَدْ مَلأَ الأُفُقَ قِيلَ هَذِهِ أُمَّتُكَ وَيَدْخُلُ الْجَنَّةَ مِنْ هَؤُلاَءِ سَبْعُونَ أَلْفًا بِغَيْرِ حِسَابٍ ثُمَّ دَخَلَ وَلَمْ يُبَيِّنْ لَهُمْ فَأَفَاضَ الْقَوْمُ وَقَالُوا نَحْنُ الَّذِينَ آمَنَّا بِاللَّهِ وَاتَّبَعْنَا رَسُولَهُ فَنَحْنُ هُمْ أَوْ أَوْلاَدُنَا الَّذِينَ وُلِدُوا فِي الإِسْلاَمِ فَإِنَّا وُلِدْنَا فِي الْجَاهِلِيَّةِ فَبَلَغَ النَّبِيَّ ﷺ فَخَرَجَ فَقَالَ هُمْ الَّذِينَ لاَ يَسْتَرْقُونَ وَلاَ يَتَطَيَّرُونَ وَلاَ يَكْتَوُونَ وَعَلَى رَبِّهِمْ يَتَوَكَّلُونَ فَقَالَ عُكَاشَةُ بْنُ مِحْصَنٍ أَمِنْهُمْ أَنَا يَا رَسُولَ اللَّهِ قَالَ نَعَمْ فَقَامَ آخَرُ فَقَالَ أَمِنْهُمْ أَنَا قَالَ سَبَقَكَ بِهَا عُكَّاشَةُ. [رواه البخاري: ٥٧٠٥]

**1960.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ümmətlər mənə göstərildi. Mən bir və ya iki peyğəmbər gördüm, yanlarında bir neçə adam var idi. Hətta elə bir peyğəmbər də gördüm ki, yanında heç kəs yox idi. (Həmin vaxt) mənə böyük bir toplum göstərildi. Mən soruşdum: “Bu nədir? Yoxsa bu mənim ümmətimdir?” (Mənə): “Bu, Musa və onun qövmüdür”– deyildi. Sonra da: “Üfüqə tərəf bax”– deyə əmr edildi. Mən orada bütün üfüqü tutmuş böyük bir toplum gördüm. (Yenə) dedilər: “Üfüqün burasına və burasına bax!” Mən orada bütün üfüqü tutmuş böyük bir toplum gördüm. Mənə: “Bu sənin ümmətindir. Onlardan yetmiş min nəfəri sorğu-sualsız Cənnətə girəcəkdir”– dedilər. (Bunu deyəndən) sonra Peyğəmbər ﷺ kimlərin (sorğu-sualsız Cənnətə girəcəklərinə dair) açıqlama verməyib (evinə) daxil oldu. (Bu səbəbdən) camaatın arasına ixtilaf düşdü və onlar dedilər: “Biz Allaha iman gətirmiş və Onun elçisinin ardınca gedən kimsələrik. (Demək, o yetmiş min nəfər) bizik, yaxud bu, müsəlman olaraq doğulmuş övladlarımıza aiddir, çünki biz cahiliyyə dövründə dünyaya gəlmişik.” Bu söhbət Peyğəmbərə ﷺ yetişdikdə o bayıra çıxıb dedi: “Bunlar özlərinə ovsun oxunmasını tələb etməyən, (hər hansı bir hadisəni) uğursuzluq əlaməti hesab etməyən, (müalicə məqsədilə) bədəninə dağ basmayan və yalnız Rəbbinə təvəkkül edən kimsələrdir.” Bu vaxt Ukkaşə ibn Mihsən dedi: “Mən onlardanammı, ya Rəsulullah?” Peyğəmbər ﷺ: “Bəli”– dedi. Sonra başqa bir adam ayağa qalxıb: “Mən də onlardanammı?”– deyə soruşdu. Peyğəmbər ﷺ dedi: “Ukkaşə səni qabaqladı.” (əl-Buxari, 5705)

[1] Badamcıq: Boğazda və əsnəkdə olan və görünüşcə badama oxşayan vəzi.

## 8-ci fəsil. Cüzam[1]

## ٨- باب: الْجُذَامُ

١٩٦١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ لاَ عَدْوَى وَلاَ طِيَرَةَ وَلاَ هَامَةَ وَلاَ صَفَرَ وَفِرَّ مِنَ الْمَجْذُومِ كَمَا تَفِرُّ مِنْ الأَسَدِ. [رواه البخاري: ٥٧٠٧]

**1961.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Nə yoluxucu xəstəlik[2], bəd əlamət[3], bayquş (uğursuzluğu)[4] və səfər[5] deyilən bir şey yoxdur. Bir də ki şirdən qaçdığın kimi cüzam xəstəliyinə tutulmuş adamdan qaç!" (əl-Buxari, 5707)

## 9-cu fəsil. Yoluxucu xəstəlik yoxdur

## ٩- باب: لاَ صَفَرَ

١٩٦٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ أَعْرَابِيٌّ يَا رَسُولَ اللَّه فَمَا بَالُ إِبِلِي تَكُونُ فِي الرَّمْلِ كَأَنَّهَا الظِّبَاءُ فَيَأْتِي الْبَعِيرُ الأَجْرَبُ فَيَدْخُلُ بَيْنَهَا فَيُجْرِبُهَا فَقَالَ فَمَنْ أَعْدَى الأَوَّلَ. [رواه البخاري: ٥٧١٧]

**1962.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "(Bir dəfə) bir bədəvi (Peyğəmbərdən ﷺ) soruşdu: "Ya Rəsulullah, mənim dəvələrimə sözün nədir?! Onlar səhrada maral kimi olurlar. Elə ki aralarına xəstə bir dəvə girir, hamısına xəstəlik düşür." Peyğəmbər dedi: "Yaxşı, bəs birincisinə xəstəliyi kim salır?!" (əl-Buxari, 5717)

## 10-cu fəsil. Plevrit[6]

## ١٠- باب: ذَاتُ الْجَنْبِ

١٩٦٣ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: أَذِنَ رَسُولُ اللَّه ﷺ لأَهْلِ بَيْتٍ مِنْ الأَنْصَارِ أَنْ يَرْقُوا مِنْ الْحُمَةِ وَالأُذُنِ قَالَ أَنَسٌ كُوِيتُ مِنْ ذَاتِ الْجَنْبِ وَرَسُولُ اللَّه ﷺ حَيٌّ وَشَهِدَنِي أَبُو طَلْحَةَ وَأَنَسُ بْنُ النَّضْرِ وَزَيْدُ بْنُ ثَابِتٍ وَأَبُو طَلْحَةَ كَوَانِي. [رواه البخاري: ٥٧١٩-٥٧٢٠]

**1963.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ ənsardan olan bir ailəyə (zəhərli heyvan) sancmasını və qulaq ağrısını (müalicə etmək üçün) ruqya oxumağa izn vermişdi.

Peyğəmbərin ﷺ sağlığında plevrit xəstəliyimdən dolayı mənim bədənimə dağ basmışdılar. Əbu Təlhə, Ənəs ibn Nədr və Zeyd ibn Sabit bunun şahidi olmuşlar. Məni dağlayan isə Əbu Təlhə olmuşdur." (əl-Buxari, 5719-5720)

---

[1] Əsasən dəri və toxumaların çürüməsi şəklində təzahür edən ağır xroniki xəstəlik.

[2] Yəni xəstəlik bir adamdan başqa birisinə öz təsiri ilə yox, yalnız və yalnız Allahın izni ilə keçə bilər.

[3] İnsanların bəd əlamət və uğursuzluq hesab etdiyi bir hadisə nəticəsində Allahın əzəldən yazdığı qəzavü-qədərin dəyişəcəyini etiqad etmək qadağandır. Bütün bunlar cahiliyyə dövründən qalma batil fərziyyələrdir.

[4] Bayquş görməyi bəd əlamət hesab etmək, onun qonduğu yerə və o ərazidə olanların başına müsibət gələcəyini iddia etmək qadağandır.

[5] Burada yoluxucu xəstəlik, yaxud səfər ayı nəzərdə tutulur. 794-cü hədisə bax.

[6] Ağ ciyər pərdəsinin iltihabı.

## 11-ci fəsil. Qızdırma Cəhənnəm istisinin (bir hissəsidir)

## ١١– باب: الْحُمَّى مِنْ فَيْحِ جَهَنَّمَ

١٩٦٤ – عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ رضي الله عنها كَانَتْ إِذَا أُتِيَتْ بِالْمَرْأَةِ قَدْ حُمَّتْ تَدْعُو لَهَا أَخَذَتْ الْمَاءَ فَصَبَّتْهُ بَيْنَهَا وَبَيْنَ جَيْبِهَا قَالَتْ وَكَانَ رَسُولُ اللَّهِ ﷺ يَأْمُرُنَا أَنْ نَبْرُدَهَا بِالْمَاءِ. [رواه البخاري: ٥٧٢٤]

**1964.** Rəvayət edilir ki, Əsma bint Əbu Bəkrin رضي الله عنها yanına qızdırmadan əziyyət çəkən qadın gətirildikdə o, (xəstə) üçün dua edər, sonra su götürüb onu qadının sinəsinə tökər və deyərdi: "Peyğəmbər ﷺ bizə qızdırmanı su ilə soyutmağı əmr edərdi." (əl-Buxari, 5724)

## 12-ci fəsil. Taun[1] barədə deyilənlər

## ١٢– باب: مَا يُذْكَرُ فِي الطَّاعُونِ

١٩٦٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ الطَّاعُونُ شَهَادَةٌ لِكُلِّ مُسْلِمٍ. [رواه البخاري: ٥٧٣٢]

**1965.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Taun xəstəliyindən ölən hər bir müsəlman şəhid sayılır." (əl-Buxari, 5732)

## 13-cü fəsil. Gözdəyməyə qarşı ruqya[2] oxumaq

## ١٣– باب: رُقْيَةُ الْعَيْنِ

١٩٦٦ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: أَمَرَنِي رَسُولُ اللَّهِ ﷺ أَوْ أَمَرَ أَنْ يُسْتَرْقَى مِنْ الْعَيْنِ. [رواه البخاري: ٥٧٣٨]

**1966.** Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Peyğəmbər ﷺ mənə (və ya qeyrisinə) gözdəyməyə qarşı ruqya oxumağı buyurdu." (əl-Buxari, 5738)

١٩٦٧ – عَنْ أُمِّ سَلَمَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ رَأَى فِي بَيْتِهَا جَارِيَةً فِي وَجْهِهَا سَفْعَةٌ فَقَالَ اسْتَرْقُوا لَهَا فَإِنَّ بِهَا النَّظْرَةَ. [رواه البخاري: ٥٧٣٩]

**1967.** Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ onun evində üzünün rəngi dəyişmiş bir qız uşağı görüb dedi: "Bu qıza ruqya oxuyun, çünki ona göz dəyib." (əl-Buxari, 5739)

## 14-cü fəsil. Əqrəb və ya ilan sancan adamı ruqya ilə müalicə etmək

## ١٤– باب: رُقْيَةُ الْحَيَّةِ وَالْعَقْرَبِ

١٩٦٨ – عَنْ عَائِشَةَ رضي الله عنها قَالَتْ: رَخَّصَ النَّبِيُّ ﷺ الرُّقْيَةَ مِنْ كُلِّ ذِي حُمَةٍ. [رواه البخاري: ٥٧٤١]

---

[1] Qusma və ishal şəklində təzahür edən ağır epidemik xəstəlik.

[2] Hərfi tərcümədə ovsun deməkdir. Lakin burada ovsun deyildikdə sehr, cadu-pitik deyil, əksinə, mübarək sözlərlə Allahın Kəlamı və ya Peyğəmbərin ﷺ duaları vasitəsilə xəstəni müalicə etmək nəzərdə tutulur.

**1968.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ hər bir zəhərli heyvan sancmasını (müalicə etmək üçün) ruqya oxumağa rüsxət vermişdir." (əl-Buxari, 5741)

### 15-ci fəsil. Peyğəmbərin ﷺ ruqya oxuması

### ١٥– باب: رُقْيَةُ النَّبِيِّ ﷺ

**١٩٦٩** – عَنْ عَائِشَةَ ﵂ أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَقُولُ لِلْمَرِيضِ بِسْمِ اللَّهِ تُرْبَةُ أَرْضِنَا بِرِيقَةِ بَعْضِنَا يُشْفَى سَقِيمُنَا بِإِذْنِ رَبِّنَا. [رواه البخاري: ٥٧٤٥]

**1969.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ xəstə adama (belə dua) oxuyurdu: "Bismillah! Turbətu ərdinə bi riqəti bədinə, yuşfa səqimuna bi izni Rabbinə.[1]" (əl-Buxari, 5745)

### 16-cı fəsil. (Gələcəyin xeyirli olacağına ümid edərək) xoş söz söyləmək

### ١٦– باب: الْفَأْلُ

**١٩٧٠** – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: قَالَ النَّبِيُّ ﷺ لاَ طِيَرَةَ وَخَيْرُهَا الْفَأْلُ قَالَ وَمَا الْفَأْلُ يَا رَسُولَ اللَّهِ قَالَ الْكَلِمَةُ الصَّالِحَةُ يَسْمَعُهَا أَحَدُكُمْ. [رواه البخاري: ٥٧٥٤]

**1970.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bəd əlamət (deyilən bir şey) yoxdur. Bunun ən xeyirlisi isə fəldır." (Əshabələrdən biri) soruşdu: "Fəl nədir, ya Rəsulullah?" Peyğəmbər ﷺ buyurdu: "Birinizin (gələcəyə dair) eşitdiyi xoş sözdür." (əl-Buxari, 5754)

### 17-ci fəsil. Kahinlik[2]

### ١٧– باب: الْكِهَانَةُ

**١٩٧١** – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَضَى فِي امْرَأَتَيْنِ مِنْ هُذَيْلٍ اقْتَتَلَتَا فَرَمَتْ إِحْدَاهُمَا الأُخْرَى بِحَجَرٍ فَأَصَابَ بَطْنَهَا وَهِيَ حَامِلٌ فَقَتَلَتْ وَلَدَهَا الَّذِي فِي بَطْنِهَا فَاخْتَصَمُوا إِلَى النَّبِيِّ ﷺ فَقَضَى أَنَّ دِيَةَ مَا فِي بَطْنِهَا

---

[1] Tərcüməsi: Allahın adı ilə! (Bu) bizim yerin torpağıdır, bəzilərimizin ağız suyu ilə qarışmışdır və xəstəmiz Rəbbimizin izni ilə sağalacaqdır.

[2] Qeybdən xəbər vermə iddiası. Qeyd etmək lazımdır ki, bu yalnız iddia ola bilər. Belə ki, qeybdən xəbər vermənin iki yolu var. a) halal: bu ancaq peyğəmbərlərə məxsus olub, özü də mütləq yox, qismən. Uca Allah buyurur: **"(Ya Rəsulum!) De: "Mən sizə demirəm ki, Allahın xəzinələri mənim yanımdadır. Mən qeybi də bilmirəm. Mən sizə demirəm ki, mən mələyəm. Mən yalnız mənə vəhy olunana tabe oluram."** "əl-Ənam" surəsi, 50. **"Qeybin açarları Allahın yanındadır, Onları yalnız O bilir."** "əl-Ənam" surəsi, 59. "**(Ya Rəsulum!) De: "Mən Allahın istədiyindən başqa özümə nə bir fayda, nə də bir zərər yetirməyə qadir deyiləm. Əgər qeybi bilsəydim, əlbəttə, *özüm üçün* xeyir artırardım və mənə pislik toxunmazdı. Mən sadəcə, iman gətirən bir qövm üçün qorxudan və müjdələyənəm."** "əl-Əraf" surəsi, 188. b) haram: kahinlərin, falabaxanların və başqa bunlar kimi qeyb xəbərlərinə girişən kimsələrin şeytanlarla dost olub onların səmavi xəbərlərdən oğurladığı sözləri onlardan eşidib insanlara bildirmək. Buna dair 444-cü, 1355-ci və 1742-ci hədislərə bax.

غُرَّةٌ عَبْدٌ أَوْ أَمَةٌ فَقَالَ وَلِيُّ الْمَرْأَةِ الَّتِي غَرِمَتْ كَيْفَ أَغْرَمُ يَا رَسُولَ اللَّهِ مَنْ لاَ شَرِبَ وَلاَ أَكَلَ وَلاَ نَطَقَ وَلاَ اسْتَهَلَّ فَمِثْلُ ذَلِكَ يُطَلُّ فَقَالَ النَّبِيُّ ﷺ إِنَّمَا هَذَا مِنْ إِخْوَانِ الْكُهَّانِ. [رواه البخاري: ٥٧٥٨]

**1971.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ Huzeyl qəbiləsindən olan, bir-birilə dalaşmış iki qadın arasında hökm verdi. Onlardan biri digər hamilə olan birisini daşla vurmuş və onun bətnindəki uşağını öldürmüşdü. Onlar mühakimə olunmaq üçün Peyğəmbərə ﷺ müraciət etdilər. Peyğəmbər ﷺ qərar verdi ki, ölmüş uşağa görə bir kölə və ya bir kəniz[1] qanbahası verilməlidir. Cərimə edilmiş qadının hamisi dedi: "Ya Rəsulullah, nə üçün mən nə (yemək) yemiş, nə (su) içmiş, nə (bir söz) danışmış, nə də doğularkən çığırmış birisinə görə cərimə ödəməliyəm? Mən beləsinin qanbahasını ödəməyi düzgün hesab etmirəm." Peyğəmbər ﷺ buyurdu: "Bu adam kahinlərin qardaşlarındandır." (əl-Buxari, 5758)

## 18-ci fəsil. Bəlağətli danışıq (bəzən) sehr kimi təsir edir

## ١٨- باب: إِنَّ مِنْ الْبَيَانِ سِحْرًا

١٩٧٢ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّهُ قَدِمَ رَجُلاَنِ مِنْ الْمَشْرِقِ فَخَطَبَا فَعَجِبَ النَّاسُ لِبَيَانِهِمَا فَقَالَ رَسُولُ اللَّهِ ﷺ إِنَّ مِنْ الْبَيَانِ لَسِحْرًا. [رواه البخاري: ٥٧٦٧]

**1972.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "(Bir dəfə) məşriqdən iki nəfər gəlib (camaat qarşısında) gözəl nitq söylədilər. Camaat onların natiqlik məharətinə heyran qaldı. Onda Peyğəmbər ﷺ buyurdu: "Bəlağətli danışıq (bəzən) sehr kimi təsir edir." (əl-Buxari, 5767)

## 19-cu fəsil. Yoluxucu xəstəlik yoxdur

## ١٩- باب: لاَ عَدْوَى

١٩٧٣ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه عَنْ النَّبِيِّ ﷺ قَالَ لاَ تُورِدُوا الْمُمْرِضَ عَلَى الْمُصِحِّ. [رواه البخاري: ٥٧٧٤]

**1973.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Xəstəni sağlam olanların arasına gətirməyin." (əl-Buxari, 5774)

## 20-ci fəsil. Zəhər içmək və zəhərlə müalicə olunmaq, belə olduqda nədən çəkinmək gərəkdir və nə pis sayılır

## ٢٠- باب: شُرْبُ السُّمِّ وَالدَّوَاءِ بِهِ وَبِمَا يُخَافُ مِنْهُ وَالْخَبِيثِ

١٩٧٤ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَنْ تَرَدَّى مِنْ جَبَلٍ فَقَتَلَ نَفْسَهُ فَهُوَ فِي نَارِ جَهَنَّمَ يَتَرَدَّى فِيهِ خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا وَمَنْ تَحَسَّى سُمًّا فَقَتَلَ نَفْسَهُ فَسُمُّهُ فِي يَدِهِ يَتَحَسَّاهُ فِي نَارِ جَهَنَّمَ خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا وَمَنْ قَتَلَ نَفْسَهُ بِحَدِيدَةٍ فَحَدِيدَتُهُ فِي يَدِهِ يَجَأُ بِهَا فِي بَطْنِهِ فِي نَارِ جَهَنَّمَ خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا. [رواه البخاري: ٥٧٧٨]

[1] Yoxdursa, beş dəvə

**1974.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim özünü dağdan atıb canına qəsd edərsə, Cəhənnəm odunda özünü daima yuxarıdan aşağı atar və orada əbədi olaraq qalar. Kim zəhər içib özünü öldürərsə, Cəhənnəm odunda o zəhəri əlində tutub həmişə zəhər içər və orada əbədi olaraq qalar. Kim dəmir parçası ilə öz canına qəsd edərsə, Cəhənnəm odunda bu dəmir parçasını daim qarnına soxar və orada əbədi olaraq qalar." (əl-Buxari, 5778)

## 21-ci fəsil. Milçək qabın içinə düşəndə (nə etmək lazımdır?)

## ٢١– باب: إِذَا وَقَعَ الذُّبَابُ فِي الإِنَاءِ

١٩٧٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّه ﷺ قَالَ إِذَا وَقَعَ الذُّبَابُ فِي إِنَاءِ أَحَدِكُمْ فَلْيَغْمِسْهُ كُلَّهُ ثُمَّ لِيَطْرَحْهُ فَإِنَّ فِي أَحَدِ جَنَاحَيْهِ شِفَاءً وَفِي الآخَرِ دَاءً. [رواه البخاري: ٥٧٨٢]

**1975.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Birinizin qabına milçək düşərsə, qoy onu basıb (qabın) içinə salsın, sonra da çıxardıb kənara atsın. Çünki onun qanadlarından birində xəstəlik, digərində isə bunun dərmanı vardır." (əl-Buxari, 5782)

# ٧٧ – كِتَابُ اللِّبَاسِ

# 77 – Libas kitabı

## ١– باب: مَا أَسْفَلَ مِنْ الْكَعْبَيْنِ فَهُوَ فِي النَّارِ

## 1-ci fəsil. Topuqdan aşağı düşən hər şey Cəhənnəm odunda yanacaq

١٩٧٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَا أَسْفَلَ مِنْ الْكَعْبَيْنِ مِنْ الإِزَارِ فَفِي النَّارِ. [رواه البخاري: ٥٧٨٧]

**1976.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Paltarın topuqdan aşağı düşən hissəsinə (görə bu topuqlar) Cəhənnəm odunda yanacaqdır." (əl-Buxari, 5787)

## ٢– باب: الْبُرُودُ وَالْحِبَرَةُ وَالشَّمْلَةُ

## 2-ci fəsil. Bürdə[1], hibərə[2] və şəmlə[3]

١٩٧٧ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ أَحَبَّ إِلَى النَّبِيِّ ﷺ أَنْ يَلْبَسَهَا الْحِبَرَةُ. [رواه البخاري: ٥٨١٣]

**1977.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbərin ﷺ ən çox sevdiyi geyim hibərə idi." (əl-Buxari, 5813)

١٩٧٨ – عَنْ عَائِشَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ حِينَ تُوُفِّيَ سُجِّيَ بِبُرْدٍ حِبَرَةٍ. [رواه البخاري: ٥٨١٤]

**1978.** Aişə ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ vəfat etdikdə onun üstünə hibərə bürüncəyi sərmişdilər. (əl-Buxari, 5814)

## ٣– باب: الثِّيَابُ الْبِيضُ

## 3-cü fəsil. Ağ paltarlar

١٩٧٩ – عَنْ أَبَا ذَرٍّ ﷺ قَالَ: أَتَيْتُ النَّبِيَّ ﷺ وَعَلَيْهِ ثَوْبٌ أَبْيَضُ وَهُوَ نَائِمٌ ثُمَّ أَتَيْتُهُ وَقَدْ اسْتَيْقَظَ فَقَالَ: مَا مِنْ عَبْدٍ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ثُمَّ مَاتَ عَلَى ذَلِكَ إِلاَّ دَخَلَ الْجَنَّةَ قُلْتُ وَإِنْ زَنَى وَإِنْ سَرَقَ قَالَ وَإِنْ زَنَى وَإِنْ سَرَقَ قُلْتُ وَإِنْ زَنَى وَإِنْ سَرَقَ قَالَ وَإِنْ زَنَى وَإِنْ سَرَقَ قُلْتُ وَإِنْ زَنَى وَإِنْ سَرَقَ قَالَ وَإِنْ زَنَى وَإِنْ سَرَقَ عَلَى رَغْمِ أَنْفِ أَبِي ذَرٍّ وَكَانَ أَبُو ذَرٍّ إِذَا حَدَّثَ بِهَذَا قَالَ وَإِنْ رَغِمَ أَنْفُ أَبِي ذَرٍّ. [رواه البخاري: ٥٨٢٧]

**1979.** Rəvayət edilir ki, Əbu Zər ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ əynində ağ paltar yatmış ikən mən onun yanına gəldim. (Mən onun yatdığını görüb çıxıb getdim və bir müddətdən) sonra yenə onun yanına gəldim. O artıq oyanmışdı. (Məni görəndə) dedi: "Lə ilahə illəllah"– deyib ölən hər bir bəndə mütləq Cənnətə daxil olacaqdır!" Mən soruşdum: "Zina və oğurluq etsə də

[1] Bədəvilərin geydiyi üzərində zolaqlar olan qara rəngli bürüncəkdir.
[2] Üzərində qırmızı və ya yaşıl zolaqlar olan Yəmən bürüncəyidir.
[3] Uzun əba.

belə?" Dedi: "Zina və oğurluq etsə də belə." (Yenə) soruşdum: "Zina və oğurluq etsə də belə?" Dedi: "Zina və oğurluq etsə də belə." (Bir daha) soruşdum: "Zina və oğurluq etsə də belə?" Dedi: "Zina və oğurluq etsə də belə, Əbu Zərin xoşuna gəlməsə də belə."

Əbu Zər hər dəfə bu hədisi danışarkən deyərdi: "Əbu Zərin xoşuna gəlməsə də belə!" (əl-Buxari, 5827)

## ٤– باب: لُبْسُ الْحَرِيرِ وَافْتِرَاشُهُ لِلرِّجَالِ وَقَدْرُ مَا يَجُوزُ مِنْهُ

## 4-cü fəsil. Kişilərin ipək paltar geyinməsi, onun üstündə uzanması və bunun nə dərəcədə caiz olması haqqında

١٩٨٠ – عَنْ أَبِي عُثْمَانَ النَّهْدِيِّ ﷺ قَالَ: أَتَانَا كِتَابُ عُمَرَ ﷺ وَنَحْنُ مَعَ عُتْبَةَ بْنِ فَرْقَدٍ بِأَذْرَبِيجَانَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ الْحَرِيرِ إِلاَّ هَكَذَا وَأَشَارَ بِإِصْبَعَيْهِ اللَّتَيْنِ تَلِيَانِ الإِبْهَامَ قَالَ فِيمَا عَلِمْنَا أَنَّهُ يَعْنِي الأَعْلاَمَ. [رواه البخاري: ٥٨٢٨]

**1980.** Rəvayət edilir ki, Əbu Osman ən-Nəhdi ﷺ demişdir: "(Bir zaman) biz Utbə ibn Fərqədlə birlikdə Azəbaycanda ikən Ömərin məktubu bizə yetişdi. (Ömər) işarə barmağı ilə orta barmağını birləşdirərək: "Bu istisna olmaqla[1] Peyğəmbər ﷺ ipək geyinməyi qadağan etmişdir"– deyə buyurdu." O, (bununla) parçanın üzərində olan zolaqları qəsd edirdi." (əl-Buxari, 5828)

١٩٨١ – عَنْ عُمَرَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ مَنْ لَبِسَ الْحَرِيرَ فِي الدُّنْيَا لَمْ يَلْبَسْهُ فِي الآخِرَةِ. [رواه البخاري: ٥٨٣٤]

**1981.** Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bu dünyada ipək geyinən, axirətdə onu geyə bilməyəcəkdir." (əl-Buxari, 5834)

## ٥– باب: افْتِرَاشُ الْحَرِيرِ

## 5-ci fəsil. Yatağa ipək döşək sərmək

١٩٨٢ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: نَهَانَا النَّبِيُّ ﷺ أَنْ نَشْرَبَ فِي آنِيَةِ الذَّهَبِ وَالْفِضَّةِ وَأَنْ نَأْكُلَ فِيهَا وَعَنْ لُبْسِ الْحَرِيرِ وَالدِّيبَاجِ وَأَنْ نَجْلِسَ عَلَيْهِ. [رواه البخاري: ٥٨٣٧]

**1982.** Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: "Peyğəmbər ﷺ bizə gümüş və qızıl qablarda (su və s.) içməyi, yemək yeməyi, bundan başqa ipək və zərxara geyinməyi, həm də onların üstündə oturmağı qadağan etmişdir." (əl-Buxari, 5837)

## ٦– باب: النَّهْيِ عَنْ التَّزَعْفُرِ لِلرِّجَالِ

## 6-cı fəsil. Kişilərə zəfərandan ətir kimi istifadə etməyin qadağan olması

١٩٨٣ – عَنْ أَنَسٍ ﷺ قَالَ: نَهَى النَّبِيُّ ﷺ أَنْ يَتَزَعْفَرَ الرَّجُلُ. [رواه البخاري: ٥٨٤٦]

---

[1] Ömərin ﷺ dediyinə görə paltarın üstündə iki barmaq yoğunluğunda ipək zolaq olarsa, həmin paltarı geyinmək olar.

**1983.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Peyğəmbər ﷺ kişilərə zəfərandan ətir kimi istifadə etməyi qadağan etmişdir.” (əl-Buxari, 5846)

### 7-ci fəsil. (Aşılandıqdan sonra) üzərində tük qalmamış dəridən tikilmiş səndəllər və başqa növ ayaqqabılar

### ٧– باب: النِّعَالُ السِّبْتِيَّةُ وَغَيْرِهَا

**١٩٨٤** – عَنْهُ ﷺ أَنَّهُ سُئِلَ: أَكَانَ النَّبِيُّ ﷺ يُصَلِّي فِي نَعْلَيْهِ؟ قَالَ: نَعَمْ. [رواه البخاري: ٥٨٥٠]

**1984.** Rəvayət edilir ki, (bir dəfə) Ənəsdən ﷺ soruşdular: “Peyğəmbər ﷺ səndəldə namaz qılardımı?” Ənəs: “Bəli!”– deyə cavab verdi. (əl-Buxari, 5850)

### 8-ci fəsil. Ayaqqabıları soyunanda əvvəlcə sol tayı çıxartmaq

### ٨– باب: يَنْزِعُ نَعْلَهُ الْيُسْرَى

**١٩٨٥** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: إِذَا انْتَعَلَ أَحَدُكُمْ فَلْيَبْدَأْ بِالْيَمِينِ وَإِذَا نَزَعَ فَلْيَبْدَأْ بِالشِّمَالِ لِيَكُنْ الْيُمْنَى أَوَّلَهُمَا تُنْعَلُ وَآخِرَهُمَا تُنْزَعُ. [رواه البخاري: ٥٨٥٦]

**1985.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Sizdən biriniz ayaqqabılarını geyindikdə sağ tayından, çıxartdıqda isə sol tayından başlasın. Qoy geyinəndə sağ tayı, çıxaranda isə sol tayı birinci olsun.” (əl-Buxari, 5856)

### 9-cu fəsil. Ayaqqabının ancaq bir tayını geyib gəzmək olmaz

### ٩– باب: لاَ يَمْشِي فِي نَعْلٍ وَاحِدَةٍ

**١٩٨٦** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: لاَ يَمْشِي أَحَدُكُمْ فِي نَعْلٍ وَاحِدَةٍ لِيُحْفِهِمَا جَمِيعًا أَوْ لِيُنْعِلْهُمَا جَمِيعًا. [رواه البخاري: ٥٨٥٥]

**1986.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Sizdən biriniz ayaqqabısının ancaq bir tayını geyib gəzməsin. Ya ikisini də çıxartsın, ya da ikisini də geyinsin.” (əl-Buxari, 5855)

### 10-cu fəsil. Peyğəmbərin ﷺ: “Mənim üzüyümün üstündə olan yazını heç kəs öz üzüyünün üstünə yazdırmasın”– sözü

### ١٠– باب: قَوْلُ النَّبِيِّ ﷺ لاَ يَنْقُشُ عَلَى نَقْشِ خَاتَمِهِ

**١٩٨٧** – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ اتَّخَذَ خَاتَمًا مِنْ فِضَّةٍ وَنَقَشَ فِيهِ مُحَمَّدٌ رَسُولُ اللَّهِ وَقَالَ إِنِّي اتَّخَذْتُ خَاتَمًا مِنْ وَرِقٍ وَنَقَشْتُ فِيهِ مُحَمَّدٌ رَسُولُ اللَّهِ فَلاَ يَنْقُشَنَّ أَحَدٌ عَلَى نَقْشِهِ. [رواه البخاري: ٥٨٧٧]

**1987.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ (özünə) gümüşdən üzük düzəltdirdi və üstünə: "Allahın rəsulu Muhəmməd" sözünü yazdırdı, sonra da belə buyurdu: "Mən gümüşdən üzük düzəltdirib üstünə: "Allahın rəsulu Muhəmməd" sözünü yazdırmışam. Odur ki, heç kəs öz üzüyünün üstünə belə bir yazı yazdırmasın." (əl-Buxari, 5877)

## 11-ci fəsil. Özlərini qadınlara oxşadan kişiləri evdən qovmaq

## ١١– باب: إِخْرَاجُ الْمُتَشَبِّهِينَ بِالنِّسَاءِ مِنْ الْبُيُوتِ

١٩٨٨ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: لَعَنَ النَّبِيُّ ﷺ الْمُخَنَّثِينَ مِنْ الرِّجَالِ وَالْمُتَرَجِّلَاتِ مِنْ النِّسَاءِ وَقَالَ أَخْرِجُوهُمْ مِنْ بُيُوتِكُمْ قَالَ فَأَخْرَجَ النَّبِيُّ ﷺ فُلَانًا وَأَخْرَجَ عُمَرُ فُلَانًا. [رواه البخاري: ٥٨٨٦]

**1988.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ özlərini qadınlara oxşadan kişiləri və özlərini kişilərə oxşadan qadınları lənətləmiş, sonra da: "Onları evlərinizdən qovun"– deyə buyurmuşdur." Peyğəmbər ﷺ filankəsi, Ömər də filankəsi (öz evindən) qovmuşdur." (əl-Buxari, 5886)

## 12-ci fəsil. Saqqal buraxmaq

## ١٢– باب: إِعْفَاءُ اللِّحَى

١٩٨٩ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: خَالِفُوا الْمُشْرِكِينَ وَفِّرُوا اللِّحَى وَأَحْفُوا الشَّوَارِبَ. [رواه البخاري: ٥٨٩٢]

**1989.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müşriklərə müxalif olun – saqqal buraxın və bığları qısaldın." (əl-Buxari, 5892)

## 13-cü fəsil. (Saç-saqqalı) boyamaq

## ١٣– باب: الْخِضَابُ

١٩٩٠ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ النَّبِيُّ ﷺ إِنَّ الْيَهُودَ وَالنَّصَارَى لاَ يَصْبُغُونَ فَخَالِفُوهُمْ. [رواه البخاري: ٥٨٩٩]

**1990.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yəhudilər və xristianlar (saç-saqqallarını) boyamırlar, siz onlara müxalif olun." (əl-Buxari, 5899)

## 14-cü fəsil. Qıvrım saçlar

## ١٤– باب: الْجَعْدُ

١٩٩١ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه قَالَ: كَانَ شَعَرُ رَسُولِ اللَّهِ ﷺ رَجِلاً لَيْسَ بِالسَّبِطِ وَلاَ الْجَعْدِ بَيْنَ أُذُنَيْهِ وَعَاتِقِهِ. [رواه البخاري: ٥٩٠٥]

**1991.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbərin ﷺ saçları nə dümdüz, nə də qıvrım idi. (Onun saçları) dalğavarı idi və qulağı ilə çiyini arasına düşürdü." (əl-Buxari, 5905)

١٩٩٢ – عَنْ أَنَسٍ ﷺ قَالَ: كَانَ النَّبِيُّ ﷺ ضَخْمَ الْيَدَيْنِ وَالْقَدَمَيْنِ حَسَنَ الْوَجْهِ لَمْ أَرَ بَعْدَهُ وَلاَ قَبْلَهُ مِثْلَهُ وَكَانَ بَسِطَ الْكَفَّيْنِ. [رواه البخاري: ٥٩٠٧]

**1992.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ əlləri və ayaqları iri, üzü gözəl bir insan idi. Mən nə ondan əvvəl, nə də ondan sonra onun kimisini görməmişdim. Əlləri də olduqca zərif idi. (əl-Buxari, 5907)

## 15-ci fəsil. Başın bir hissəsini qırxıb bir hissəsini saxlamaq

## ١٥– باب: الْقَزَعُ

١٩٩٣ – عَنْ ابْنِ عُمَرَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ نَهَى عَنْ الْقَزَعِ. [رواه البخاري: ٥٩٢١]

**1993.** İbn Ömər ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ başın bir hissəsini qırxıb bir hissəsini saxlamağı qadağan etmişdir. (əl-Buxari, 5921)

## 16-cı fəsil. Başa və saqqala ətir sürtmək

## ١٦– باب: الطِّيبُ فِي الرَّأْسِ وَاللِّحْيَةِ

١٩٩٤ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: كُنْتُ أُطَيِّبُ النَّبِيَّ ﷺ بِأَطْيَبِ مَا يَجِدُ حَتَّى أَجِدَ وَبِيصَ الطِّيبِ فِي رَأْسِهِ وَلِحْيَتِهِ. [رواه البخاري: ٥٩٢٣]

**1994.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ tapdığı ən gözəl iyli ətirdən ona o qədər vurardım ki, hətta bu ətirin parıltısını onun saçında və saqqalında görərdim." (əl-Buxari, 5923)

## 17-ci fəsil. Ətirdən imtina etməyən kimsə haqqında

## ١٧– باب: مَنْ لَمْ يَرُدَّ الطِّيبَ

١٩٩٥ – عَنْ أَنَسٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ لاَ يَرُدُّ الطِّيبَ. [رواه البخاري: ٥٩٢٩]

**1995.** Ənəs ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ (heç vaxt) ətirdən imtina etməzdi. (əl-Buxari, 5929)

## 18-ci fəsil. Zərirə[1]

## ١٨– باب: الذَّرِيرَةُ

١٩٩٦ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: طَيَّبْتُ رَسُولَ اللَّهِ ﷺ بِيَدَيَّ بِذَرِيرَةٍ فِي حَجَّةِ الْوَدَاعِ لِلْحِلِّ وَالإِحْرَامِ. [رواه البخاري: ٥٩٣٠]

**1996.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən vida həccində Peyğəmbərə ﷺ – o ihramda ikən və ihramdan çıxdıqdan sonra – bu əllərimlə zərirə vurmuşam." (əl-Buxari, 5930)

[1] Ətir növü.

## 19-cu fəsil. Rəsm çəkənlərin Qiyamət günü əzaba düçar olması haqqında

## ١٩– باب: عَذَابُ الْمُصَوِّرِينَ يَوْمَ الْقِيَامَةِ

١٩٩٧ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: إِنَّ الَّذِينَ يَصْنَعُونَ هَذِهِ الصُّوَرَ يُعَذَّبُونَ يَوْمَ الْقِيَامَةِ يُقَالُ لَهُمْ أَحْيُوا مَا خَلَقْتُمْ. [رواه البخاري: ٥٩٥١]

**1997.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bu rəsmləri çəkən kimsələr Qiyamət günü əzaba giriftar olacaqlar. Onlara deyiləcəkdir: "Yaratdıqlarınıza can verin (görək)!" (əl-Buxari, 5951)

## 20-ci fəsil. Rəsmləri pozmaq

## ٢٠– باب: نَقْضُ الصُّوَرِ

١٩٩٨ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ قَالَ اللَّهُ عَزَّ وَجَلَّ وَمَنْ أَظْلَمُ مِمَّنْ ذَهَبَ يَخْلُقُ كَخَلْقِي فَلْيَخْلُقُوا حَبَّةً أَوْ لِيَخْلُقُوا ذَرَّةً. وَ فِي رِوَايَةٍ: فَلْيَخْلُقُوا شَعِيرَةً. [رواه البخاري: ٥٩٥٣]

**1998.** Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qüdrətli və əzəmətli Allah buyurmuşdur: "Mənim yaratdığım kimi yaratmağa çalışan kimsədən daha zalım kim ola bilər?! (Bacarırlarsa,) qoy bir dən yaratsınlar, yaxud bir zərrə yaratsınlar!"

Digər rəvayətdə: "...qoy bir arpa dənəsi yaratsınlar!" (əl-Buxari, 5953)

# ٧٨ – كِتَابُ الأَدَبِ

# 78 – Ədəb kitabı

## ١– باب: مَنْ أَحَقُّ النَّاسِ بِحُسْنِ الصُّحْبَةِ

## 1-ci fəsil. İnsanlar arasında ən çox kimin qayğısına qalmaq gərəkdir

١٩٩٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللَّهِ ﷺ فَقَالَ: يَا رَسُولَ اللَّهِ مَنْ أَحَقُّ النَّاسِ بِحُسْنِ صَحَابَتِي قَالَ أُمُّكَ قَالَ ثُمَّ مَنْ قَالَ ثُمَّ أُمُّكَ قَالَ ثُمَّ مَنْ قَالَ ثُمَّ أُمُّكَ قَالَ ثُمَّ مَنْ قَالَ ثُمَّ أَبُوكَ. [رواه البخاري: ٥٩٧١]

**1999.** Əbu Hureyra ﷺ rəvayət edir ki, bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Ya Rəsulullah, mən ən çox kimə qayğı göstərməliyəm?" Dedi: "Anana!" Adam (yenə) soruşdu: "Sonra kimə?" Dedi: "Anana!" Adam (bir də) soruşdu: "Sonra kimə?" Dedi: "Anana!" (Axırıncı dəfə): "Sonra kimə?"– soruşduqda, o: "Atana!"– dedi." (əl-Buxari, 5971)

## ٢– باب: لاَ يَسُبُّ الرَّجُلُ وَالِدَيْهِ

## 2-ci fəsil. Adam öz valideynlərini söyməməlidir

٢٠٠٠ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ إِنَّ مِنْ أَكْبَرِ الْكَبَائِرِ أَنْ يَلْعَنَ الرَّجُلُ وَالِدَيْهِ قِيلَ يَا رَسُولَ اللَّهِ وَكَيْفَ يَلْعَنُ الرَّجُلُ وَالِدَيْهِ قَالَ يَسُبُّ الرَّجُلُ أَبَا الرَّجُلِ فَيَسُبُّ أَبَاهُ وَيَسُبُّ أُمَّهُ. [رواه البخاري: ٥٩٧٣]

**2000.** Abdullah ibn Amr ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ: "Adamın öz valideynlərini lənətləməsi böyük günahlardandır"– dedi. (Əshabələr təəccüblə) dedilər: "Ya Rəsulullah, heç adam da öz valideynlərini lənətləyərmi?" Peyğəmbər ﷺ buyurdu: "Bir adam başqa birisinin atasını söyər, o da qayıdıb onun ata-anasını söyər". (əl-Buxari, 5973)

## ٣– باب: إِثْمُ الْقَاطِعِ

## 3-cü fəsil. Qohumluq əlaqələrini kəsməyin günahı

٢٠٠١ – عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ لاَ يَدْخُلُ الْجَنَّةَ قَاطِعٌ. [رواه البخاري: ٥٩٨٤]

**2001.** Rəvayət edilir ki, Cubeyr ibn Mutim ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qohumluq əlaqələrini kəsən adam Cənnətə girməz." (əl-Buxari, 5984)

## ٤– باب: مَنْ وَصَلَ وَصَلَهُ اللَّهُ

## 4-cü fəsil. (Qohumluq bağlarını) qoruyub saxlayanı Allah qoruyar

٢٠٠٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: إِنَّ الرَّحِمَ شَجْنَةٌ مِنَ الرَّحْمَنِ فَقَالَ اللَّهُ مَنْ وَصَلَكِ وَصَلْتُهُ وَمَنْ قَطَعَكِ قَطَعْتُهُ. [رواه البخاري: ٥٩٨٩]

**2002.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Rəhm ər-Rəhman ismindən əmələ gəlmiş bir sözdür[1]. Allah (ona belə) buyurmuşdu: "Səni birləşdirəni birləşdirərəm, kəsəni də kəsərəm." (əl-Buxari, 5989)

## 5-ci fəsil. Qohumluq bağlarını qoruyub saxladıqca səmərəsi artır

## ٥– باب: تُبَلُّ الرَّحِمُ بِبَلاَلِهَا

٢٠٠٣ – عَنْ عَمْرِو بْنِ الْعَاصِ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ جِهَارًا غَيْرَ سِرٍّ يَقُولُ إِنَّ آلَ أَبِي لَيْسُوا بِأَوْلِيَائِي إِنَّمَا وَلِيِّيَ اللَّهُ وَصَالِحُ الْمُؤْمِنِينَ، وَلَكِنْ لَهُمْ رَحِمٌ أَبُلُّهَا بِبَلاَهَا. [رواه البخاري: ٥٩٩٠]

**2003.** Rəvayət edilir ki, Amr ibn As ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ uca səslə heç nəyi gizlətmədən belə dediyini eşitmişəm: "Atamın qohum-əqrəbası mənim himayədarım sayıla bilməz. Mənim himayədarlarım ancaq Allah və əməlisaleh möminlərdir. Sadəcə məni onlara bağlayan qohumluq əlaqələridir və bu əlaqələri qoruyub saxlayacağam." (əl-Buxari, 5990)

## 6-cı fəsil. Qohumluq əlaqələrini qarşılıqlı olaraq saxlayan adam əlaqə quran kəs sayıla bilməz

## ٦– باب: لَيْسَ الْوَاصِلُ بِالْمُكَافِئِ

٢٠٠٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ لَيْسَ الْوَاصِلُ بِالْمُكَافِئِ وَلَكِنْ الْوَاصِلُ الَّذِي إِذَا قُطِعَتْ رَحِمُهُ وَصَلَهَا. [رواه البخاري: ٥٩٩١]

**2004.** Abdullah ibn Amr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qohumluq əlaqələrini qarşılıqlı olaraq saxlayan adam əlaqə quran kimsə sayıla bilməz. Həqiqi əlaqə quran o kimsədir ki, qohumu onunla əlaqələri kəssə də, onu yenidən qursun." (əl-Buxari, 5991)

## 7-ci fəsil. Uşağa rəhm etmək, onu öpmək və qucaqlamaq haqqında

## ٧– باب: رَحْمَةُ الْوَلَدِ وَتَقْبِيلُهُ وَمُعَانَقَتُهُ

٢٠٠٥ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: جَاءَ أَعْرَابِيٌّ إِلَى النَّبِيِّ ﷺ فَقَالَ: تُقَبِّلُونَ الصِّبْيَانَ فَمَا نُقَبِّلُهُمْ فَقَالَ النَّبِيُّ ﷺ أَوَأَمْلِكُ لَكَ أَنْ نَزَعَ اللَّهُ مِنْ قَلْبِكَ الرَّحْمَةَ. [رواه البخاري: ٥٩٩٨]

**2005.** Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "(Bir dəfə) bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Siz uşaqlarınızı öpürsünüz?! Amma biz onları öpmürük." Peyğəmbər ﷺ dedi: "Əgər Allah sənin qəlbindən mərhəmət hissini götürmüşsə, ona mən nə edə bilərəm?" (əl-Buxari, 5998)

[1] Qohumluq əlaqəsi Allahın mərhəməti ilə bağlı olan rəhmət əlamətlərindəndir.

٢٠٠٦ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ ﷺ قَدِمَ عَلَى النَّبِيِّ ﷺ سَبْيٌ فَإِذَا امْرَأَةٌ مِنَ السَّبْيِ قَدْ تَحْلُبُ ثَدْيَهَا تَسْقِي إِذَا وَجَدَتْ صَبِيًّا فِي السَّبْيِ أَخَذَتْهُ فَأَلْصَقَتْهُ بِبَطْنِهَا وَأَرْضَعَتْهُ فَقَالَ لَنَا النَّبِيُّ ﷺ أَتُرَوْنَ هَذِهِ طَارِحَةً وَلَدَهَا فِي النَّارِ قُلْنَا لاَ وَهِيَ تَقْدِرُ عَلَى أَنْ لاَ تَطْرَحَهُ فَقَالَ لَلَّهُ أَرْحَمُ بِعِبَادِهِ مِنْ هَذِهِ بِوَلَدِهَا. [رواه البخاري: ٥٩٩٩]

**2006.** Ömər ibn Xəttab ﷺ rəvayət edir ki, (bir dəfə döyüşdə götürülmüş) əsirləri Peyğəmbərin ﷺ yanına gətirdilər. Əsirlər arasında olan bir qadın döşündən süd sağıb (körpələrə) içirdirdi. Əsirlər arasında körpə uşaq tapan kimi onu qucağına alıb əmizdirirdi." Onda Peyğəmbər ﷺ bizdən soruşdu: "Sizcə bu qadın körpəsini oda atarmı?" Biz dedik: "Əgər bu ixtiyar onun əlində olsa, xeyr, (atmaz)." Peyğəmbər ﷺ dedi: "Allahın Öz qullarına olan mərhəməti bu qadının körpəsinə olan mərhəmətindən (qat-qat) üstündür." (əl-Buxari, 5999)

## 8-ci fəsil. Allah mərhəməti yüz hissədən ibarət etmişdir

## ٨– باب: جَعَلَ اللَّهُ الرَّحْمَةَ مِائَةَ جُزْءٍ

٢٠٠٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: جَعَلَ اللَّهُ الرَّحْمَةَ مِائَةَ جُزْءٍ فَأَمْسَكَ عِنْدَهُ تِسْعَةً وَتِسْعِينَ جُزْءًا وَأَنْزَلَ فِي الأَرْضِ جُزْءًا وَاحِدًا فَمِنْ ذَلِكَ الْجُزْءِ يَتَرَاحَمُ الْخَلْقُ حَتَّى تَرْفَعَ الْفَرَسُ حَافِرَهَا عَنْ وَلَدِهَا خَشْيَةَ أَنْ تُصِيبَهُ. [رواه البخاري: ٦٠٠٠]

**2007.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Allah mərhəməti yüz hissədən ibarət etdi. Doxsan doqquzunu Özündə saxlayıb təkcə bir hissəsini yer üzünə endirdi. Məhz bunun sayəsində yaradılanlar bir-birinə rəhm edir. Hətta, at öz balasını tapdalamasın deyə ayaqlarını yuxarı qaldırır." (əl-Buxari, 6000)

## 9-cu fəsil. Körpəni ayağın üstə oturtmaq barəsində

## ٩– باب: وَضْعُ الصَّبِيِّ عَلَى الْفَخِذِ

٢٠٠٨ – عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ﷺ كَانَ رَسُولُ اللَّهِ ﷺ يَأْخُذُنِي فَيُقْعِدُنِي عَلَى فَخِذِهِ وَيُقْعِدُ الْحَسَنَ عَلَى فَخِذِهِ الأُخْرَى ثُمَّ يَضُمُّنَا ثُمَّ يَقُولُ اللَّهُمَّ ارْحَمْهُمَا فَإِنِّي أَرْحَمُهُمَا. [رواه البخاري: ٦٠٠٣]

**2008.** Usamə ibn Zeyd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ məni bir ayağının üstündə, Həsəni də digər ayağının üstündə oturdub bizi qucaqlayar və (dua edib) deyərdi: "Allahım, mən bunlara rəhm edirəm, Sən də onlara rəhm et!" (əl-Buxari, 6003)

## 10-cu fəsil. İnsanlara və heyvanlara mərhəmət göstərmək

## ١٠– باب: رَحْمَةُ النَّاسِ وَالْبَهَائِمِ

٢٠٠٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَامَ رَسُولُ اللَّهِ ﷺ فِي صَلاَةٍ وَقُمْنَا مَعَهُ فَقَالَ أَعْرَابِيٌّ وَهُوَ فِي الصَّلاَةِ اللَّهُمَّ ارْحَمْنِي وَمُحَمَّدًا وَلاَ تَرْحَمْ مَعَنَا أَحَدًا فَلَمَّا سَلَّمَ النَّبِيُّ ﷺ قَالَ لِلأَعْرَابِيِّ لَقَدْ حَجَّرْتَ وَاسِعًا. [رواه البخاري: ٦٠١٠]

**2009.** Əbu Hureyra ؓ rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birlikdə namaz qılarkən bir bədəvi namazda dua edib dedi: “Allahım, mənə və Muhəmmədə rəhm et, bizimlə yanaşı heç kəsə rəhm etmə.” Peyğəmbər ﷺ salam verib (namazı bitirdikdən) sonra o bədəviyə dedi: “Sən geniş olan (bir şeyi) daraltdın!” (əl-Buxari, 6010)

**٢٠١٠** – عَنْ النُّعْمَانِ بْنِ بَشِيرٍ ؓ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ تَرَى الْمُؤْمِنِينَ فِي تَرَاحُمِهِمْ وَتَوَادِّهِمْ وَتَعَاطُفِهِمْ كَمَثَلِ الْجَسَدِ إِذَا اشْتَكَى عُضْوًا تَدَاعَى لَهُ سَائِرُ جَسَدِهِ بِالسَّهَرِ وَالْحُمَّى. [رواه البخاري: ٦٠١١]

**2010.** Nomən ibn Bəşir ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Sən möminlərin bir-birilərinə mərhəmət göstərməkdə, bir-birilərini sevməkdə və bir-birilərinə can yandırmaqda bir bədən kimi olduğunu görürsən. Belə ki, (bədənin) bir əzasına xəstəlik üz verdikdə bütün bədən yuxusuzluqdan və qızdırmadan əziyyət çəkir.” (əl-Buxari, 6011)

**٢٠١١** – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ؓ عَنْ النَّبِيِّ ﷺ قَالَ مَا مِنْ مُسْلِمٍ غَرَسَ غَرْسًا فَأَكَلَ مِنْهُ إِنْسَانٌ أَوْ دَابَّةٌ إِلاَّ كَانَ لَهُ بِهِ صَدَقَةٌ. [رواه البخاري: ٦٠١٢]

**2011.** Ənəs ibn Malik ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hansı bir müsəlman bir ağac əkər və onun (əkdiyi ağacın) bəhrəsindən insan və ya heyvan yeyərsə, bu o müsəlman üçün sədəqə sayılar.” (əl-Buxari, 6012)

**٢٠١٢** – عَنْ جَرِيرِ بْنِ عَبْدِ اللَّهِ البَجَلِيِّ ؓ عَنْ النَّبِيِّ ﷺ قَالَ مَنْ لاَ يَرْحَمُ لاَ يُرْحَمُ. [رواه البخاري: ٦٠١٣]

**2012.** Cərir ibn Abdullah əl-Bəcəli ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Rəhm etməyən kimsəyə rəhm edilməz.” (əl-Buxari, 6013)

## 11-ci fəsil. Qonşuya dair tövsiyə

## ١١– باب: الْوَصَاةُ بِالْجَارِ

**٢٠١٣** – عَنْ عَائِشَةَ ؓ عَنْ النَّبِيِّ ﷺ قَالَ مَا زَالَ يُوصِينِي جِبْرِيلُ بِالْجَارِ حَتَّى ظَنَنْتُ أَنَّهُ سَيُوَرِّثُهُ. [رواه البخاري: ٦٠١٤]

**2013.** Aişə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cəbrail qonşu haqqında mənə o qədər tövsiyə etdi ki, qonşuya da mirasdan pay düşəcəyini güman etdim.” (əl-Buxari, 6014)

## 12-ci fəsil. Qonşusunun şərindən əmin olmayan kimsənin günahı

## ١٢– باب: إِثْمُ مَنْ لاَ يَأْمَنُ جَارُهُ بَوَائِقَهُ

**٢٠١٤** – عَنْ أَبِي شُرَيْحٍ ؓ أَنَّ النَّبِيَّ ﷺ قَالَ وَاللَّهِ لاَ يُؤْمِنُ وَاللَّهِ لاَ يُؤْمِنُ وَاللَّهِ لاَ يُؤْمِنُ قِيلَ وَمَنْ يَا رَسُولَ اللَّهِ قَالَ الَّذِي لاَ يَأْمَنُ جَارُهُ بَوَايِقَهُ. [رواه البخاري: ٦٠١٦]

**2014.** Əbu Şureyh ؓ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ buyurdu: “Vallahi, mömin deyil, vallahi, mömin deyil, vallahi, mömin deyil!” Soruşdular: “Kim, ya Rəsulullah?” Dedi: “Qonşusu, şərindən əmin olmayan kimsə!” (əl-Buxari, 6016)

## 13-cü fəsil. Kim Allaha və Axirət gününə inanırsa, qonşusuna əziyyət verməsin

## ١٣– باب: مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلاَ يُؤْذِ جَارَهُ

٢٠١٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلاَ يُؤْذِ جَارَهُ وَمَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيُكْرِمْ ضَيْفَهُ وَمَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيَقُلْ خَيْرًا أَوْ لِيَصْمُتْ. [رواه البخاري: ٦٠١٨]

**2015.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Kim Allaha və Axirət gününə inanırsa, qonşusuna əziyyət verməsin. Kim Allaha və Axirət gününə inanırsa, qonağına yaxşı baxsın. Kim Allaha və Axirət gününə inanırsa, ya xeyir danışsın, ya da sussun.” (əl-Buxari, 6018)

## 14-cü fəsil. Hər bir yaxşılıq sədəqədir

## ١٤– باب: كُلُّ مَعْرُوفٍ صَدَقَةٌ

٢٠١٦ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: كُلُّ مَعْرُوفٍ صَدَقَةٌ. [رواه البخاري: ٦٠٢١]

**2016.** Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər bir yaxşılıq sədəqədir.” (əl-Buxari, 6021)

## 15-ci fəsil. Hər bir işdə mülayim olmaq

## ١٥– باب: الرِّفْقُ فِي الأَمْرِ كُلِّهِ

٢٠١٧ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: قَالَ النَّبِيُّ ﷺ إِنَّ اللَّهَ يُحِبُّ الرِّفْقَ فِي الأَمْرِ كُلِّهِ. [رواه البخاري: ٦٠٢٤]

**2017.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allah hər bir işdə mülayim olmağı sevir.” (əl-Buxari, 6024)

## 16-cı fəsil. Möminlərin bir-birilərinə əl tutması

## ١٦– باب: تَعَاوُنُ الْمُؤْمِنِينَ بَعْضُهُمْ بَعْضًا

٢٠١٨ – عَنْ أَبِي مُوسَى ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: الْمُؤْمِنُ لِلْمُؤْمِنِ كَالْبُنْيَانِ يَشُدُّ بَعْضُهُ بَعْضًا ثُمَّ شَبَّكَ بَيْنَ أَصَابِعِهِ وَكَانَ النَّبِيُّ ﷺ جَالِسًا إِذْ جَاءَ رَجُلٌ يَسْأَلُ أَوْ طَالِبُ حَاجَةٍ أَقْبَلَ عَلَيْنَا بِوَجْهِهِ فَقَالَ اشْفَعُوا فَلْتُؤْجَرُوا وَلْيَقْضِ اللَّهُ عَلَى لِسَانِ نَبِيِّهِ مَا شَاءَ. [رواه البخاري: ٦٠٢٧]

**2018.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ: “Möminlər bir bina kimidirlər, bir-birilərini dəstəkləyirlər”– dedi, sonra da barmaqlarını bir-birinə keçirtdi. Həmin vaxt Peyğəmbər ﷺ oturmuşdu. Birdən bir nəfər gəlib ondan yardım istədi. Peyğəmbər ﷺ üzünü bizə tutub dedi: “Havadarlıq edin ki, savab qazanasınız, Allah da Öz peyğəmbərinin dili ilə istədiyini yerinə yetirsin.” (əl-Buxari, 6027)

## ١٧– باب: لَمْ يَكُنْ النَّبِيُّ ﷺ فَاحِشًا وَلاَ مُتَفَحِّشًا

## 17-ci fəsil. Peyğəmbər ﷺ ədəbsiz və kobud olmamışdır

٢٠١٩ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: لَمْ يَكُنْ النَّبِيُّ ﷺ سَبَّابًا وَلاَ فَحَّاشًا وَلاَ لَعَّانًا كَانَ يَقُولُ لأَحَدِنَا عِنْدَ الْمَعْتَبَةِ مَا لَهُ تَرِبَ جَبِينُهُ. [رواه البخاري: ٦٠٣١]

**2019.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ nə söyüş söyən, nə ədəbsizlik edən, nə də lənət oxuyan (bir adam) olmuşdur. Birimizi tənbeh edərkən deyərdi: "Ona nə olub?! Alnı yerə sürtülsün[1]". (əl-Buxari, 6031)

## ١٨– باب: حُسْنُ الْخُلُقِ وَالسَّخَاءِ وَمَا يُكْرَهُ مِنْ الْبُخْلِ

## 18-ci fəsil. Gözəl əxlaqın və comərdliyin (gərəkli olması) və xəsisliyin bəyənilməməsi

٢٠٢٠ – عَنْ جَابِرٍ ﷺ قَالَ: مَا سُئِلَ النَّبِيُّ ﷺ عَنْ شَيْءٍ قَطُّ فَقَالَ لاَ. [رواه البخاري: ٦٠٣٤]

**2020.** Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Peyğəmbərdən ﷺ bir şey istədikdə o heç vaxt yox deməzdi." (əl-Buxari, 6034)

٢٠٢١ – عَنْ أَنَسٍ ﷺ قَالَ: خَدَمْتُ النَّبِيَّ ﷺ عَشْرَ سِنِينَ فَمَا قَالَ لِي أُفٍّ وَلاَ لِمَ صَنَعْتَ وَلاَ أَلاَّ صَنَعْتَ. [رواه البخاري: ٦٠٣٧]

**2021.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Mən on il Peyğəmbərə ﷺ xidmət etdim, bir dəfə də olsun mənə nə "uf!", nə "niyə belə etmisən?", nə də "niyə belə etməmisən?" dedi." (əl-Buxari, 6037)

## ١٩– باب: مَا يُنْهَى مِنْ السِّبَابِ وَاللَّعْنِ

## 19-cu fəsil. Söyüş söyməyin və lənət oxumağın qadağan olunması

٢٠٢٢ – عَنْ أَبِي ذَرٍّ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ لاَ يَرْمِي رَجُلٌ رَجُلاً بِالْفُسُوقِ وَلاَ يَرْمِيهِ بِالْكُفْرِ إِلاَّ ارْتَدَّتْ عَلَيْهِ إِنْ لَمْ يَكُنْ صَاحِبُهُ كَذَلِكَ. [رواه البخاري: ٦٠٤٥]

**2022.** Rəvayət edilir ki, Əbu Zərr ﷺ Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Bir adam başqa birisinin fasiqlikdə və ya küfrdə ittiham edərsə və (ittiham edilən) adam belə deyilsə, (bu ittiham) onun özünə qayıdar." (əl-Buxari, 6045)

٢٠٢٣ – عَنْ ثَابِتِ بْنِ الضَّحَّاكِ ﷺ وَكَانَ مِنْ أَصْحَابِ الشَّجَرَةِ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ مَنْ حَلَفَ عَلَى مِلَّةٍ غَيْرِ الإِسْلاَمِ فَهُوَ كَمَا قَالَ وَلَيْسَ عَلَى ابْنِ آدَمَ نَذْرٌ فِيمَا لاَ يَمْلِكُ وَمَنْ قَتَلَ نَفْسَهُ بِشَيْءٍ فِي الدُّنْيَا عُذِّبَ بِهِ يَوْمَ الْقِيَامَةِ وَمَنْ لَعَنَ مُؤْمِنًا فَهُوَ كَقَتْلِهِ وَمَنْ قَذَفَ مُؤْمِنًا بِكُفْرٍ فَهُوَ كَقَتْلِهِ. [رواه البخاري: ٦٠٤٧]

**2023.** Ağac altında beyət edən əshabələrdən Sabit ibn Dəhhak ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ demişdir:

---

[1] Ehtimal ki, ibadət əsnasında səcdə etmək nəzərdə tutulur. "Fəthul-Bari" 10/453.

– kim İslamdan başqa bir din üzərində olduğuna and içərsə, and içdiyi kimi olar;

– Adəm oğlu gücü çatmadığı bir şeyi nəzir edəcəyinə dair söz verməməlidir;

– kim bu dünyada (hər hansı) bir şeylə öz canına qəsd edərsə, Qiyamət günü həmin şeylə ona əzab verilər;

– kim bir möminə lənət oxuyarsa, onu öldürmüş hesab olunar;

– habelə, kim bir mömini küfrdə ittiham edərsə, onu öldürmüş hesab edilər." (əl-Buxari, 6047)

## 20-ci fəsil. Söz gəzdirməyin bəyənilməməsi

## ٢٠– باب: مَا يُكْرَهُ مِنْ النَّمِيمَةِ

٢٠٢٤ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ لاَ يَدْخُلُ الْجَنَّةَ قَتَّاتٌ. [رواه البخاري: ٦٠٥٦]

**2024.** Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Dedi-qodu yayan Cənnətə girməz!" (əl-Buxari, 6056)

## 21-ci fəsil. (Kimsəni) ifrat dərəcədə mədh etməyin bəyənilməməsi

## ٢١– باب: مَا يُكْرَهُ مِنْ التَّمَادُحِ

٢٠٢٥ – عَنْ أَبِي بَكْرَةَ ﷺ أَنَّ رَجُلاً ذُكِرَ عِنْدَ النَّبِيِّ ﷺ فَأَثْنَى عَلَيْهِ رَجُلٌ خَيْرًا فَقَالَ النَّبِيُّ ﷺ وَيْحَكَ قَطَعْتَ عُنُقَ صَاحِبِكَ يَقُولُهُ مِرَارًا إِنْ كَانَ أَحَدُكُمْ مَادِحًا لاَ مَحَالَةَ فَلْيَقُلْ أَحْسِبُ كَذَا وَكَذَا إِنْ كَانَ يُرَى أَنَّهُ كَذَلِكَ وَحَسِيبُهُ اللَّهُ وَلاَ يُزَكِّي عَلَى اللَّهِ أَحَدًا. [رواه البخاري: ٦٠٦١]

**2025.** Əbu Bəkrə ﷺ rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanında başqa birisini tərifləməyə başladı. (Bunu eşidəndə) Peyğəmbər ﷺ (ona): "Vay sənin halına! Sən qardaşının boynunu qırdın!"– dedi və bunu bir neçə dəfə təkrar etdi. (Sonra buyurdu): "Sizdən biriniz öz qardaşını tərifləməyi lazım bilərsə, onun tərifə layiq olduğunu güman edərsə, qoy desin: "(Filankəsi) filan cür adam hesab edirəm." Onun (həqiqətdə) nə cür insan olduğunu isə ancaq Allah bilir. Kimsə Allaha rəğmən başqa birisini təmizə çıxartmamalıdır." (əl-Buxari, 6061)

## 22-ci fəsil. Bir-birinə paxıllıq etməyin və bir-birinə arxa çevirməyin qadağan olması

## ٢٢– باب: مَا يُنْهَى عَنْ التَّحَاسُدِ وَالتَّدَابُرِ

٢٠٢٦ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ لاَ تَبَاغَضُوا وَلاَ تَحَاسَدُوا وَلاَ تَدَابَرُوا وَكُونُوا عِبَادَ اللَّهِ إِخْوَانًا وَلاَ يَحِلُّ لِمُسْلِمٍ أَنْ يَهْجُرَ أَخَاهُ فَوْقَ ثَلاَثَةِ أَيَّامٍ. [رواه البخاري: ٦٠٦٥]

**2026.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bir-birinizə nifrət etməyin, bir-birinizə həsəd aparmayın, bir-birinizə arxa çevirməyin. Ey Allahın qulları, qardaş olun! Heç bir müsəlmana üç gündən artıq qardaşı ilə küsülü qalması halal sayılmaz." (əl-Buxari, 6065)

٢٠٢٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: إِيَّاكُمْ وَالظَّنَّ فَإِنَّ الظَّنَّ أَكْذَبُ الْحَدِيث وَلاَ تَحَسَّسُوا وَلاَ تَجَسَّسُوا وَلاَ تَنَاجَشُوا وَلاَ تَحَاسَدُوا وَلاَ تَبَاغَضُوا وَلاَ تَدَابَرُوا وَكُونُوا عِبَادَ اللَّهِ إِخْوَانًا. [رواه البخاري: ٦٠٦٦]

**2027.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Zənnə qapılmaqdan çəkinin! Çünki zənn ən yalan söhbətdir. Bir-birinizin eybini axtarmayın, casusluq etməyin, bir-birinizlə rəqabət aparmayın, bir-birinizə həsəd aparmayın, bir-birinizə nifrət etməyin, bir-birinizə arxa çevirməyin. Ey Allahın qulları, qardaş olun!” (əl-Buxari, 6066)

## ٢٣– باب: مَا يَجُوزُ مِنْ الظَّنِّ

## 23-cü fəsil. Caiz olan zənn barəsində

٢٠٢٨ – عَنْ عَائِشَةَ ﷺ قَالَتْ: قَالَ النَّبِيُّ ﷺ مَا أَظُنُّ فُلاَنًا وَفُلاَنًا يَعْرِفَانِ مِنْ دِينِنَا شَيْئًا. وَ فِي رِوَايَةٍ: يَعْرِفَانِ دِينَنَا الَّذِي نَحْنُ عَلَيْهِ. [رواه البخاري: ٦٠٦٨]

**2028.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mən filankəsin və filankəsin bizim dinimizdən nə isə bildiyini zənn etmirəm.”

Digər rəvayətdə demişdir: “....bizim dinimizdən nə isə bildiyini zənn etmirəm.” (əl-Buxari, 6068)

## ٢٤– باب: سَتْرُ الْمُؤْمِنِ عَلَى نَفْسِهِ

## 24-cü fəsil. Möminin öz günahlarını ört-basdır etməsi

٢٠٢٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: كُلُّ أُمَّتِي مُعَافًى إِلاَّ الْمُجَاهِرِينَ وَإِنَّ مِنْ الْمُجَاهَرَةِ أَنْ يَعْمَلَ الرَّجُلُ بِاللَّيْلِ عَمَلاً ثُمَّ يُصْبِحَ وَقَدْ سَتَرَهُ اللَّهُ عَلَيْهِ فَيَقُولَ يَا فُلاَنُ عَمِلْتُ الْبَارِحَةَ كَذَا وَكَذَا وَقَدْ بَاتَ يَسْتُرُهُ رَبُّهُ وَيُصْبِحُ يَكْشِفُ سِتْرَ اللَّهِ عَنْهُ. [رواه البخاري: ٦٠٦٩]

**2029.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Ümmətimin hamısı əfv ediləcək. Yalnız açıq-aşkar (günah) işlədənlərdən başqa. (Məsələn) birisi gecə bir qələt edir və səhəri gün Allah onun bu qələtini ört-basdır etdiyi halda (dost-aşnasına): “Ey filankəs, mən bu gecə filan, filan işləri görmüşəm”deyir. Gecə Rəbbi onun (günahının) üstünə örtük çəkir, səhər isə o, Allahın bu örtüyünü açır.” (əl-Buxari, 6069)

## ٢٥– باب: الْهِجْرَةُ وَقَوْلُ رَسُولِ اللَّهِ ﷺ لاَ يَحِلُّ لِرَجُلٍ أَنْ يَهْجُرَ أَخَاهُ فَوْقَ ثَلاَثِ لَيَالٍ

## 25-ci fəsil. Küsmək və Peyğəmbərin ﷺ: “Heç bir müsəlmana üç gündən artıq qardaşı ilə küsülü qalması halal olmaz” sözü

٢٠٣٠ – عَنْ أَبِي أَيُّوبَ الأَنْصَارِيِّ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: لاَ يَحِلُّ لِرَجُلٍ أَنْ يَهْجُرَ أَخَاهُ فَوْقَ ثَلاَثِ لَيَالٍ يَلْتَقِيَانِ فَيُعْرِضُ هَذَا وَيُعْرِضُ هَذَا وَخَيْرُهُمَا الَّذِي يَبْدَأُ بِالسَّلاَمِ. [رواه البخاري: ٦٠٧٧]

**2030.** Əbu Əyyub əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heç bir kimsəyə üç gündən artıq qardaşı ilə küsülü qalması halal olmaz. Qarşı-qarşıya gəldikdə bu (ondan) üz çevirir, o da (bundan) üz çevirir. Onların ən xeyirlisi salamı birinci verib (sözə) başlayanıdır." (əl-Buxari, 6077)

## 26-cı fəsil. Uca Allahın: "Ey iman gətirənlər! Allahdan qorxun və düz danışanlarla birlikdə olun"[1] sözü, habelə yalan danışmağın qadağan olunması

## ٢٦– باب: قَوْلُ اللَّهِ تَعَالَى: ﴿ يَٰٓأَيُّهَا ٱلَّذِينَ ءَامَنُواْ ٱتَّقُواْ ٱللَّهَ وَكُونُواْ مَعَ ٱلصَّٰدِقِينَ ﴾ وَمَا يُنْهَى عَنْ الْكَذِبِ

٢٠٣١ – عَنْ عَبْدِ اللَّهِ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: إِنَّ الصِّدْقَ يَهْدِي إِلَى الْبِرِّ وَإِنَّ الْبِرَّ يَهْدِي إِلَى الْجَنَّةِ وَإِنَّ الرَّجُلَ لَيَصْدُقُ حَتَّى يَكُونَ صِدِّيقًا وَإِنَّ الْكَذِبَ يَهْدِي إِلَى الْفُجُورِ وَإِنَّ الْفُجُورَ يَهْدِي إِلَى النَّارِ وَإِنَّ الرَّجُلَ لَيَكْذِبُ حَتَّى يُكْتَبَ عِنْدَ اللَّهِ كَذَّابًا. [رواه البخاري: ٦٠٩٤]

**2031.** Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Doğruluq (adamı) yaxşı işlər görməyə yönəldir. Yaxşı işlər isə (adamı) Cənnətə aparır. Həqiqətən, adam o qədər doğru danışır ki, nəhayət, (Allah yanında) doğruçu sayılır. Yalan isə (adamı) günah işlərə yönəldir. Günah işlər də (adamı) Cəhənnəmə aparır. Həqiqətən, adam o qədər yalan danışır ki, axırda, Allah yanında yalançı sayılır." (əl-Buxari, 6094)

## 27-ci fəsil. Əziyyətə səbir etmək

## ٢٧– باب: الصَّبْرُ عَلَى الأَذَى

٢٠٣٢ – عَنْ أَبِي مُوسَى ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: لَيْسَ أَحَدٌ أَوْ لَيْسَ شَيْءٌ أَصْبَرَ عَلَى أَذًى سَمِعَهُ مِنْ اللَّهِ إِنَّهُمْ لَيَدْعُونَ لَهُ وَلَدًا وَإِنَّهُ لَيُعَافِيهِمْ وَيَرْزُقُهُمْ. [رواه البخاري: ٦٠٩٩]

**2032.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Özü haqda) eşitdiyi nalayiq sözlərə Allahdan daha çox səbir edən bir kimsə, yaxud bir məxluq yoxdur. Belə ki, (qulları) Ona övlad isnad edirlər, O isə onlara can sağlığı və (çoxlu) ruzi bəxş edir." (əl-Buxari, 6099)

## 28-ci fəsil. Qəzəblənməkdən çəkinmək

## ٢٨– باب: الْحَذَرُ مِنْ الْغَضَبِ

٢٠٣٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: لَيْسَ الشَّدِيدُ بِالصُّرَعَةِ إِنَّمَا الشَّدِيدُ الَّذِي يَمْلِكُ نَفْسَهُ عِنْدَ الْغَضَبِ. [رواه البخاري: ٦١١٤]

**2033.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Hamını) yıxmaq güclü olmaq demək deyildir. Güclü o kəsdir ki, qəzəbləndikdə özünü ələ ala bilsin." (əl-Buxari, 6114)

---

[1] "ət-Tovbə" surəsi, 119.

٢٠٣٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَجُلاً قَالَ لِلنَّبِيِّ ﷺ أَوْصِنِي قَالَ لاَ تَغْضَبْ فَرَدَّدَ مِرَارًا قَالَ لاَ تَغْضَبْ. [رواه البخاري: ٦١١٦]

**2034.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib: "Mənə nəsihət et!"- dedi. Peyğəmbər ﷺ buyurdu: "Qəzəblənmə!" Adam (dediyini) bir neçə dəfə təkrar etdi. Peyğəmbər ﷺ dedi: "Qəzəblənmə!" (əl-Buxari, 6116)

## 29-cu fəsil. Həyalı olmaq

## ٢٩– باب: الْحَيَاءُ

٢٠٣٥ – عَنْ عِمْرَانَ بْنَ حُصَيْنٍ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ الْحَيَاءُ لاَ يَأْتِي إِلاَّ بِخَيْرٍ. [رواه البخاري: ٦١١٧]

**2035.** İmran ibn Husayn ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həyalı olmaq (insana) ancaq xeyir gətirər!" (əl-Buxari, 6117)

## 30-cu fəsil. "Utanmırsansa, istədiyini et!"

## ٣٠– باب: إِذَا لَمْ تَسْتَحْيِ فَاصْنَعْ مَا شِئْتَ

٢٠٣٦ – عَنْ أَبِي مَسْعُودٍ الأَنْصَارِيِّ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ إِنَّ مِمَّا أَدْرَكَ النَّاسُ مِنْ كَلاَمِ النُّبُوَّةِ الأُولَى إِذَا لَمْ تَسْتَحْيِ فَاصْنَعْ مَا شِئْتَ. [رواه البخاري: ٦١٢٠]

**2036.** Əbu Məsud əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İlk peyğəmbərlik kəlamından insanların yaddaşında qalan (və zamanımıza qədər gəlib çatan) söz (belədir ki): "Utanmırsansa, istədiyini et!" (əl-Buxari, 6120)

## 31-ci fəsil. İnsanlarla mehriban rəftar etmək

## ٣١– باب: الاِنْبِسَاطُ إِلَى النَّاسِ

٢٠٣٧ – عَنْ أَنَسَ بْنَ مَالِكٍ ﷺ قَالَ: إِنْ كَانَ النَّبِيُّ ﷺ لَيُخَالِطُنَا حَتَّى يَقُولَ لأَخٍ لِي صَغِيرٍ يَا أَبَا عُمَيْرٍ مَا فَعَلَ النُّغَيْرُ. [رواه البخاري: ٦١٢٩]

**2037.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bizim yanımıza gələrdi və mənim balaca qardaşıma: "Ey Əbu Umeyr, quşcuğaza nə oldu?"– deyərdi[1]. (əl-Buxari, 6129)

## 32-ci fəsil. Mömin bir yuvadan iki dəfə sancılmaz

## ٣٢– باب: لاَ يُلْدَغُ الْمُؤْمِنُ مِنْ جُحْرٍ مَرَّتَيْنِ

٢٠٣٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ قَالَ: لاَ يُلْدَغُ الْمُؤْمِنُ مِنْ جُحْرٍ وَاحِدٍ مَرَّتَيْنِ. [رواه البخاري: ٦١٣٣]

---

[1] Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bizim yanımıza gələrdi. Mənim Əbu Umeyr adlı balaca qardaşım var idi. Onun quşcuğazı var idi. Uşaq onunla oynayardı. (Bir gün) quşcuğaz öldü. Peyğəmbər ﷺ yanımıza gəldikdə onun qəmgin olduğunu görüb soruşdu ki: "Buna nə olub?" Dedilər: "Quşcuğazı ölüb." Peyğəmbər ﷺ dedi: "Ey Əbu Umeyr, quşcuğaza nə oldu?" (Ədəbul-Mufrad, 847)

**2038.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Mömin bir yuvadan iki dəfə sancılmaz[1]”. (əl-Buxari, 6133)

## 33-cü fəsil. Caiz sayılan, habelə bəyənilməyən şeir, rəcəz və hida haqqında

## ٣٣- باب: مَا يَجُوزُ مِنْ الشِّعْرِ وَالرَّجَزِ وَالْحِدَاءِ وَمَا يُكْرَهُ مِنْهُ

٢٠٣٩ – عَنْ أُبَيِّ بْنِ كَعْبٍ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: إِنَّ مِنْ الشِّعْرِ حِكْمَةً. [رواه البخاري: ٦١٤٥]

**2039.** Ubey ibn Kəb ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Şeirin bir qismi hikmətdir.” (əl-Buxari, 6145)

## 34-cü fəsil. Şeir insanı o həddə gətirib çatdırmamalıdır ki, bu onu Allahı zikr etməkdən, elm öyrənməkdən və Quran oxumaqdan yayındırsın

## ٣٤- باب: مَا يُكْرَهُ أَنْ يَكُونَ الْغَالِبَ عَلَى الإِنْسَانِ الشِّعْرُ حَتَّى يَصُدَّهُ عَنْ ذِكْرِ اللَّهِ وَالْعِلْمِ وَالْقُرْآنِ

٢٠٤٠ – عَنْ ابْنِ عُمَرَ ﵄ عَنْ النَّبِيِّ ﷺ قَالَ لأَنْ يَمْتَلِئَ جَوْفُ أَحَدِكُمْ قَيْحًا خَيْرٌ لَهُ مِنْ أَنْ يَمْتَلِئَ شِعْرًا. [رواه البخاري: ٦١٥٤]

**2040.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Birinizin qarnının irinlə doldurulması, onun üçün şeirlə dolmasından daha xeyirlidir.” (əl-Buxari, 6154)

## 35-ci fəsil. Birinin (kiməsə): “Ay biçarə!” deməsi

## ٣٥- باب: مَا جَاءَ فِي قَوْلِ الرَّجُلِ وَيْلَكَ

٢٠٤١ – عَنْ أَنَسٍ ﵁ أَنَّ رَجُلاً مِنْ أَهْلِ الْبَادِيَةِ أَتَى النَّبِيَّ ﷺ فَقَالَ يَا رَسُولَ اللَّهِ مَتَى السَّاعَةُ قَائِمَةٌ قَالَ وَيْلَكَ وَمَا أَعْدَدْتَ لَهَا قَالَ مَا أَعْدَدْتُ لَهَا إِلاَّ أَنِّي أُحِبُّ اللَّهَ وَرَسُولَهُ قَالَ إِنَّكَ مَعَ مَنْ أَحْبَبْتَ فَقُلْنَا وَنَحْنُ كَذَلِكَ قَالَ نَعَمْ. [رواه البخاري: ٦١٦٧]

**2041.** Ənəs ﵁ rəvayət edir ki, (bir dəfə) bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ya Rəsulullah, Qiyamət nə zaman qopacaq?” Peyğəmbər ﷺ buyurdu: “Ay biçarə, sən Qiyamətə nə tədarük görmüsən?” Adam dedi: “Heç bir tədarük görməmişəm. Mən sadəcə Allahı və Onun rəsulunu sevirəm.” Peyğəmbər ﷺ buyurdu: “Sən sevdiyin kəslə bir yerdə olacaqsan!” Biz soruşduq: “Bu bizə də aiddirmi?” Peyğəmbər ﷺ: “Bəli!”- dedi.” (əl-Buxari, 6167)

[1] Yəni, bir işdə başına müsibət gələrsə, ikinci dəfə o işi görməz.

**36-cı fəsil.** (Qiyamət günü) **insanlara atalarının adları ilə müraciət olunacaqdır**

**٣٦- باب:**
**مَا يُدْعَى النَّاسُ بِآبَائِهِمْ**

٢٠٤٢ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: إِنَّ الْغَادِرَ يُنْصَبُ لَهُ لِوَاءٌ يَوْمَ الْقِيَامَةِ يُقَالُ هَذِهِ غَدْرَةُ فُلاَنِ بْنِ فُلاَنٍ. [رواه البخاري: ٦١٧٧]

**2042.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü hər bir xain üçün bir bayraq sancılacaq[1] və deyiləcək: "Bu, xain filankəs ibn filankəsdir." (əl-Buxari, 6177)

**37-ci fəsil. Peyğəmbərin ﷺ: "Kərim ancaq möminin qəlbidir[2]" sözü**

**٣٧- باب:**
**قَوْلُ النَّبِيِّ ﷺ إِنَّمَا الْكَرْمُ قَلْبُ الْمُؤْمِنِ**

٢٠٤٣ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لاَ تُسَمُّوا العِنَبَ الْكَرْمَ إِنَّمَا الْكَرْمُ قَلْبُ الْمُؤْمِنِ. [رواه البخاري: ٦١٨٣]

**2043.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üzümə kərim"– deməyin. Çünki kərim ancaq möminin qəlbidir." (əl-Buxari, 6183)

**38-ci fəsil.**
**Bir adı daha gözəl adla dəyişmək**

**٣٨- باب:**
**تَحْوِيلُ الاِسْمِ إِلَى اسْمٍ أَحْسَنَ مِنْهُ**

٢٠٤٤ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه أَنَّ زَيْنَبَ كَانَ اسْمُهَا بَرَّةَ فَقِيلَ تُزَكِّي نَفْسَهَا فَسَمَّاهَا رَسُولُ اللَّهِ ﷺ زَيْنَبَ. [رواه البخاري: ٦١٩٢]

**2044.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Zeynəbin رضي الله عنها adı Bərra idi. Ona: "Sən özünü təmizə çıxardırsan"– deyildi, sonra Peyğəmbər ﷺ ona Zeynəb adını verdi. (əl-Buxari, 6192)

**39-cu fəsil. Bir adam dostunu adı ilə çağırdıqda onun adından bir hərf əksiltməsi**

**٣٩- باب:**
**مَنْ دَعَا صَاحِبَهُ فَنَقَصَ مِنْ اسْمِهِ حَرْفًا**

٢٠٤٥ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: كَانَتْ أُمُّ سُلَيْمٍ فِي الثَّقَلِ وَأَنْجَشَةُ غُلاَمُ النَّبِيِّ ﷺ يَسُوقُ بِهِنَّ فَقَالَ النَّبِيُّ ﷺ يَا أَنْجَشُ رُوَيْدَكَ سَوْقَكَ بِالْقَوَارِيرِ. [رواه البخاري: ٦٢٠٢]

[1] Xain tanınsın deyə onun yanında yerə bayraq sancılacaq.
[2] Yəni ancaq mömin əsl kərəm və səxavət, lütf və ehsan sahibidir.

**2045.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "(Bir dəfə) Ummu Suleym ﷺ yüklərə nəzarət edən qadınların arasında ikən Peyğəmbərin ﷺ köləsi Əncəşə ﷺ onların mindiyi dəvələri (bərk) sürüb aparırdı. Peyğəmbər ﷺ buyurdu: "Ey Əncəş, asta ol, şüşələri[1] sındırarsan." (əl-Buxari, 6202)

## 40-cı fəsil. Allahın ən çox nifrət etdiyi adlar

## ٤٠ – باب: أَبْغَضُ الأَسْمَاءِ إِلَى اللَّهِ

٢٠٤٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ أَخْنَى الأَسْمَاءِ يَوْمَ الْقِيَامَةِ عِنْدَ اللَّهِ رَجُلٌ تَسَمَّى مَلِكَ الأَمْلاَكِ. [رواه البخاري: ٦٢٠٥]

**2046.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü Allah yanında ən çirkin ad, özünü padşahlar padşahı adlandıran kimsənin adı olacaq."[2] (əl-Buxari, 6205)

## 41-ci fəsil. Asqıran adamın: "Əlhəmdulillah!" deməsi

## ٤١ – باب: الْحَمْدُ لِلْعَاطِسِ

٢٠٤٧ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: عَطَسَ رَجُلاَنِ عِنْدَ النَّبِيِّ ﷺ فَشَمَّتَ أَحَدَهُمَا وَلَمْ يُشَمِّتِ الآخَرَ فَقِيلَ لَهُ فَقَالَ هَذَا حَمِدَ اللَّهَ وَهَذَا لَمْ يَحْمَدِ اللَّهَ. [رواه البخاري: ٦٢٢١]

**2047.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "(Bir dəfə) iki kişi Peyğəmbərin ﷺ yanında asqırdı və Peyğəmbər ﷺ onlardan birinə: "Yərhəmukəllah"– dedi, o birinə isə (heç nə) demədi. (Peyğəmbərdən ﷺ bunun səbəbini) soruşduqda o dedi: "Bu adam: "Əlhəmdulillah"– dedi, bu isə demədi." (əl-Buxari, 6221)

## 42-ci fəsil. Asqırmağın bəyənilməsi, əsnəməyin isə bəyənilməməsi

## ٤٢ – باب: مَا يُسْتَحَبُّ مِنَ الْعُطَاسِ وَمَا يُكْرَهُ مِنَ التَّثَاؤُبِ

٢٠٤٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: إِنَّ اللَّهَ يُحِبُّ الْعُطَاسَ وَيَكْرَهُ التَّثَاؤُبَ فَإِذَا عَطَسَ فَحَمِدَ اللَّهَ فَحَقٌّ عَلَى كُلِّ مُسْلِمٍ سَمِعَهُ أَنْ يُشَمِّتَهُ وَأَمَّا التَّثَاؤُبُ فَإِنَّمَا هُوَ مِنَ الشَّيْطَانِ فَلْيَرُدَّهُ مَا اسْتَطَاعَ فَإِذَا قَالَ هَا ضَحِكَ مِنْهُ الشَّيْطَانُ. [رواه البخاري: ٦٢٢٣]

**2048.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah (Öz qullarının) asqırmağını sevir, əsnəməyini isə xoşlamır. (Müsəlman kimsə) asqırıb Allaha həmd etsə, ona: "Yərhəmukəllah"– demək, bunu eşidən hər bir müsəlmana vacibdir. Əsnəmək isə şeytandandır. İnsan bacardığı qədər onun qarşısını almalıdır. Adam: "Haaah"– etdiyi zaman şeytan ona gülər." (əl-Buxari, 6223)

---

[1] Peyğəmbər ﷺ şüşə deyəndə qadınları nəzərdə tuturdu.

[2] Demək, kiməsə padşahlar padşahı, hökmdarlar hökmdarı, şahlar şahı və başqa bu kimi adlar vermək qadağandır.

# ٧٩ – كِتَابُ الاِسْتِئْذَانِ

# 79 – İzn istəmək kitabı

## ١– باب: تَسْلِيمُ الْقَلِيلِ عَلَى الْكَثِيرِ

## 1-ci fəsil. Az sayda olan toplumun çox sayda olanlara salam verməsi

٢٠٤٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: يُسَلِّمُ الصَّغِيرُ عَلَى الْكَبِيرِ وَالْمَارُّ عَلَى الْقَاعِدِ وَالْقَلِيلُ عَلَى الْكَثِيرِ. [رواه البخاري: ٦٢٣١]

**2049.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kiçik böyüyə, piyada oturana və az sayda olan toplum çox sayda olanlara salam verməlidir." (əl-Buxari, 6231)

## ٢– باب: تَسْلِيمُ الرَّاكِبُ عَلَى الْمَاشِي

## 2-ci fəsil. Minik üstə olanın piyada olana salam verməsi

٢٠٥٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: يُسَلِّمُ الرَّاكِبُ عَلَى الْمَاشِي وَالْمَاشِي عَلَى الْقَاعِدِ وَالْقَلِيلُ عَلَى الْكَثِيرِ. [رواه البخاري: ٦٢٣٣]

**2050.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Minik üstə olan kəs piyadaya, piyada oturana və az sayda olan toplum çox sayda olanlara salam verməlidir." (əl-Buxari, 6233)

## ٣– باب: السَّلاَمُ لِلْمَعْرِفَةِ وَغَيْرِ الْمَعْرِفَةِ

## 3-cü fəsil. Tanıdığına və tanımadığına salam vermək

٢٠٥١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﷺ أَنَّ رَجُلاً سَأَلَ النَّبِيَّ ﷺ أَيُّ الإِسْلاَمِ خَيْرٌ؟ قَالَ: تُطْعِمُ الطَّعَامَ وَتَقْرَأُ السَّلاَمَ عَلَى مَنْ عَرَفْتَ وَعَلَى مَنْ لَمْ تَعْرِفْ. [رواه البخاري: ٦٢٣٦]

**2051.** Abdullah ibn Amr ﷺ rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərdən ﷺ soruşdu: "İslam (xislətlərindən) ən xeyirlisi hansıdır?" Peyğəmbər ﷺ buyurdu: "Yemək yedirtməyin, tanıdığına və tanımadığına salam verməyin." (əl-Buxari, 6236)

## ٤– باب: الاِسْتِئْذَانُ مِنْ أَجْلِ الْبَصَرِ

## 4-cü fəsil. İzn istəmək (xəlvəti) baxışlardan dolayı (vacib buyurulmuşdur)

٢٠٥٢ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﷺ قَالَ: اطَّلَعَ رَجُلٌ مِنْ جُحْرٍ فِي حُجَرِ النَّبِيِّ ﷺ وَمَعَ النَّبِيِّ ﷺ مِدْرًى يَحُكُّ بِهِ رَأْسَهُ فَقَالَ لَوْ أَعْلَمُ أَنَّكَ تَنْظُرُ لَطَعَنْتُ بِهِ فِي عَيْنِكَ إِنَّمَا جُعِلَ الاِسْتِئْذَانُ مِنْ أَجْلِ الْبَصَرِ. [رواه البخاري: ٦٢٤١]

**2052.** Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ demişdir: "(Bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ hücrələrindən birinin (qapısının) dəliyindən içəri baxmağa başladı.

Həmin vaxt Peyğəmbər ﷺ əlindəki dəmir daraqla başını qaşıyırdı. Sonra Peyğəmbər ﷺ (ona) dedi: "Əgər sənin (xəlvətcə) baxdığını bilsəydim, bu darağı sənin gözünə soxardım. İzn istəmək də məhz belə baxışlardan dolayı vacib buyurulmuşdur." (əl-Buxari, 6241)

## 5-ci fəsil. Cinsiyyət üzvündən başqa bədən üzvlərinin zina etməsi haqqında

## ٥- باب: زِنَا الْجَوَارِحِ دُونَ الْفَرْجِ

٢٠٥٣ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: إِنَّ اللَّهَ كَتَبَ عَلَى ابْنِ آدَمَ حَظَّهُ مِنْ الزِّنَا أَدْرَكَ ذَلِكَ لَا مَحَالَةَ فَزِنَا الْعَيْنِ النَّظَرُ وَزِنَا اللِّسَانِ الْمَنْطِقُ وَالنَّفْسُ تَمَنَّى وَتَشْتَهِي وَالْفَرْجُ يُصَدِّقُ ذَلِكَ كُلَّهُ وَيُكَذِّبُهُ. [رواه البخاري: ٦٢٤٣]

**2053.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həqiqətən, Allah zinadan Adəm oğlunun payına düşəni əzəldən yazmışdır və o, istər-istəməz buna mübtəla olacaqdır. Gözün zinası baxmaqdır, dilin zinası danışmaqdır, nəfs də təmənna edir və istəyir. Cinsiyyət üzvü isə ya bütün bunları təsdiqləyir, ya da təkzib edir." (əl-Buxari, 6243)

## 6-cı fəsil. Uşaqlara salam vermək

## ٦- باب: التَّسْلِيمُ عَلَى الصِّبْيَانِ

٢٠٥٤ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه أَنَّهُ مَرَّ عَلَى صِبْيَانٍ فَسَلَّمَ عَلَيْهِمْ وَقَالَ كَانَ النَّبِيُّ ﷺ يَفْعَلُهُ. [رواه البخاري: ٦٢٤٧]

**2054.** Rəvayət edilir ki, (bir dəfə) Ənəs ibn Malik رضي الله عنه (bir dəstə) uşağın yanından keçərkən onlara salam verdi və dedi: "Peyğəmbər ﷺ də belə edərdi." (əl-Buxari, 6247)

## 7-ci fəsil. (Ev yiyəsi) "Kimdir o?"– deyə soruşduqda: "Mənəm!"– deyə hay vermək haqqında

## ٧- باب: إِذَا قَالَ مَنْ ذَا؟ فَقَالَ: أَنَا

٢٠٥٥ – عَنْ جَابِرِ بْنِ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: أَتَيْتُ النَّبِيَّ ﷺ فِي دَيْنٍ كَانَ عَلَى أَبِي فَدَقَقْتُ الْبَابَ فَقَالَ مَنْ ذَا؟ فَقُلْتُ: أَنَا فَقَالَ: أَنَا أَنَا كَأَنَّهُ كَرِهَهَا. [رواه البخاري: ٦٢٥٠]

**2055.** Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: "(Bir dəfə) mən atamın borcuna dair (məsləhət almaq üçün) Peyğəmbərin ﷺ yanına gəlib qapını döydüm. O soruşdu: "Kimdir o?" Dedim: "Mənəm." O, narazı qalmış halda: "Mənəm, mənəm![1]"– dedi." (əl-Buxari, 6250)

## 8-ci fəsil. Məclislərdə yer vermək

## ٨- باب: التَّفَسُّحِ فِي الْمَجَالِسِ

٢٠٥٦ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ أَنَّهُ نَهَى أَنْ يُقَامَ الرَّجُلُ مِنْ مَجْلِسِهِ وَيَجْلِسَ فِيهِ آخَرُ وَلَكِنْ تَفَسَّحُوا وَتَوَسَّعُوا. [رواه البخاري: ٦٢٧٠]

[1] Qapını döyən adamdan onun kim olduğu soruşularsa, o, müəmmalı şəkildə cavab verməməli və kim olduğunu hökmən bildirməlidir.

**2056.** Abdullah ibn Ömər ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ bizə bir kimsəni yerindən qaldırıb onun yerinə oturmağı qadağan etmişdir. Lakin sıx oturun və *bir-birinizə* yer verin!" (əl-Buxari, 6270)

## 9-cu fəsil. Yerə oturub dizləri qucaqlamaq

## ٩– باب: الاحْتِبَاءِ بِالْيَدِ

٢٠٥٧ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: رَأَيْتُ رَسُولَ اللَّهِ ﷺ بِفِنَاءِ الْكَعْبَةِ مُحْتَبِيًا بِيَدِهِ هَكَذَا. [رواه البخاري: ٦٢٧٢]

**2057.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbəri ﷺ Kəbənin həyətində yerə oturub dizlərini qucaqladığını gördüm." (əl-Buxari, 6272)

## 10-cu fəsil. Üç nəfərdən çox olan camaat (arasında iki nəfərin) xəlvətcə danışmasında heç bir qəbahət yoxdur

## ١٠– باب: إِذَا كَانُوا أَكْثَرَ مِنْ ثَلاَثَةٍ فَلاَ بَأْسَ بِالْمُسَارَّةِ وَالْمُنَاجَاةِ

٢٠٥٨ – عَنْ عَبْدِ اللَّهِ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ إِذَا كُنْتُمْ ثَلاَثَةً فَلاَ يَتَنَاجَى رَجُلاَنِ دُونَ الآخَرِ حَتَّى تَخْتَلِطُوا بِالنَّاسِ أَجْلَ أَنْ يُحْزِنَهُ. [رواه البخاري: ٦٢٨٨]

**2058.** Abdulla (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç nəfər olduğunuz zaman, camaatın yanına gəlib çıxanadək (sizdən) ikisi öz aralarında pıçıldaşıb üçüncüsünü kənarda qoymasın. (Yoxsa bu hərəkət) onu kədərləndirər." (əl-Buxari, 6288)

## 11-ci fəsil. Yatmağa gedəndə evdə (istifadə edilən) odu yana-yana qoymaq olmaz

## ١١– باب: لاَ تُتْرَكُ النَّارُ فِي الْبَيْتِ عِنْدَ النَّوْمِ

٢٠٥٩ – عَنْ أَبِي مُوسَى رضي الله عنه قَالَ: احْتَرَقَ بَيْتٌ بِالْمَدِينَةِ عَلَى أَهْلِهِ مِنْ اللَّيْلِ فَحُدِّثَ بِشَأْنِهِمْ النَّبِيُّ ﷺ قَالَ إِنَّ هَذِهِ النَّارَ إِنَّمَا هِيَ عَدُوٌّ لَكُمْ فَإِذَا نِمْتُمْ فَأَطْفِئُوهَا عَنْكُمْ. [رواه البخاري: ٦٢٩٤]

**2059.** Rəvayət edilir ki, Əbu Musa ﷺ demişdir: "(Bir dəfə) gecə vaxtı Mədinədə bir ev, sakinləri içində ikən yandı. Onların başına gələn (bu müsibət haqda) Peyğəmbərə ﷺ xəbər verildikdə o dedi: "Bu od, həqiqətən də, sizin düşməninizdir. Odur ki, yatmağa gedəndə onu söndürün." (əl-Buxari, 6294)

## 12-ci fəsil. Bina etmək haqqında deyilənlər

## ١٢– باب: مَا جَاءَ فِي الْبِنَاءِ

٢٠٦٠ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: رَأَيْتُنِي مَعَ النَّبِيِّ ﷺ بَنَيْتُ بِيَدِي بَيْتًا يُكِنُّنِي مِنْ الْمَطَرِ وَيُظِلُّنِي مِنْ الشَّمْسِ مَا أَعَانَنِي عَلَيْهِ أَحَدٌ مِنْ خَلْقِ اللَّهِ. [رواه البخاري: ٦٣٠٢]

**2060.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ dövründə bu əllərimlə məni yağışdan və günəşdən qoruyacaq bir ev tikmişdim. Onu tikərkən Allahın yaratdıqlarından heç kəs mənə kömək etməmişdi." (əl-Buxari, 6302)

# ٨٠ – كِتَابُ الدَّعَوَاتِ

# 80 – Dualar kitabı

## ١– باب: لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ مُسْتَجَابَةٌ

## 1-ci fəsil. Hər bir peyğəmbərin qəbul edilmiş duası olub

٢٠٦١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: لِكُلِّ نَبِيٍّ دَعْوَةٌ مُسْتَجَابَةٌ يَدْعُو بِهَا وَأُرِيدُ أَنْ أَخْتَبِئَ دَعْوَتِي شَفَاعَةً لِأُمَّتِي فِي الآخِرَةِ. [رواه البخاري: ٦٣٠٤]

**2061.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hər bir peyğəmbərin qəbul edilmiş duası olmuşdur ki, o (artıq) bu dua ilə Allaha müraciət etmişdir. Mən isə öz duamı axirətdə ümmətimə şəfaət etmək üçün saxlamışam." (əl-Buxari, 6304)

## ٢– باب: أَفْضَلُ الاسْتِغْفَارِ

## 2-ci fəsil. Ən fəzilətli istiğfar[1]

٢٠٦٢ – عَنْ شَدَّادِ بْنِ أَوْسٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: سَيِّدُ الاسْتِغْفَارِ أَنْ تَقُولَ: اللَّهُمَّ أَنْتَ رَبِّي لاَ إِلَهَ إِلاَّ أَنْتَ خَلَقْتَنِي وَأَنَا عَبْدُكَ وَأَنَا عَلَى عَهْدِكَ وَوَعْدِكَ مَا اسْتَطَعْتُ أَعُوذُ بِكَ مِنْ شَرِّ مَا صَنَعْتُ أَبُوءُ لَكَ بِنِعْمَتِكَ عَلَيَّ وَأَبُوءُ لَكَ بِذَنْبِي فَاغْفِرْ لِي فَإِنَّهُ لاَ يَغْفِرُ الذُّنُوبَ إِلاَّ أَنْتَ قَالَ وَمَنْ قَالَهَا مِنَ النَّهَارِ مُوقِنًا بِهَا فَمَاتَ مِنْ يَوْمِهِ قَبْلَ أَنْ يُمْسِيَ فَهُوَ مِنْ أَهْلِ الْجَنَّةِ وَمَنْ قَالَهَا مِنَ اللَّيْلِ وَهُوَ مُوقِنٌ بِهَا فَمَاتَ قَبْلَ أَنْ يُصْبِحَ فَهُوَ مِنْ أَهْلِ الْجَنَّةِ. [رواه البخاري: ٦٣٠٦]

**2062.** Şəddad ibn Ovs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ən üstün istiğfar belədir: "Allahım, Sən mənim Rəbbimsən. Səndən başqa məbud yoxdur. Məni Sən yaratdın və mən Sənin qulunam. Bacardığım qədər Sənə verdiyim əhdə və vədə sadiq qalacağam. Etdiklərimin şərindən Sənə sığınıram. Mənə verdiyin neməti etiraf edirəm və günahımı boynuma alıram. Məni bağışla! Şübhəsiz ki, günahları yalnız Sən bağışlayırsan!"[2] (Sonra Peyğəmbər ﷺ) buyurdu: "Kim gündüz vaxtı bu duanı yəqinliklə deyər və həmin gün axşam düşməzdən əvvəl ölərsə, Cənnət əhlindən olar. Habelə kim axşam ikən bunu yəqinliklə deyər və səhər açılmazdan əvvəl ölərsə, Cənnət əhlindən olar." (əl-Buxari, 6306)

## ٣– باب: اسْتِغْفَارُ النَّبِيِّ ﷺ فِي الْيَوْمِ وَاللَّيْلَةِ

## 3-cü fəsil. Peyğəmbərin ﷺ gecə və gündüz istiğfar qılması

٢٠٦٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: وَاللَّهِ إِنِّي لأَسْتَغْفِرُ اللَّهَ وَأَتُوبُ إِلَيْهِ فِي الْيَوْمِ أَكْثَرَ مِنْ سَبْعِينَ مَرَّةً. [رواه البخاري: ٦٣٠٧]

---

[1] Allaha yalvararaq günahlarının bağışlanmasını istəmək.

[2] Transkripsiyası: Allahummə, əntə rabbi lə ilahə illə ənt, xaləqtəni və ənə abdukə və ənə alə ahdikə və vədikə məs-tətətu, əuzu bikə min şərri mə sənətu. Əbuu ləkə binimətikə aleyyə və əbuu ləkə bizənbi. Fəğfirli fə innəhu lə yəğfiruz-zunubə illə ənt.

**2063.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Vallahi, mən hər gün yetmiş dəfədən çox Allahdan həm bağışlanma diləyir, həm də Ona tövbə edirəm.” (əl-Buxari, 6307)

## 4-cü fəsil. Tövbə etmək
## ٤ – باب: التَّوْبَةُ

٢٠٦٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ مَسْعُودٍ ﵁ حَدَّثَ بِحَدِيثَيْنِ: أَحَدُهُمَا عَنِ النَّبِيِّ ﷺ وَالآخَرُ عَنْ نَفْسِهِ قَالَ: إِنَّ الْمُؤْمِنَ يَرَى ذُنُوبَهُ كَأَنَّهُ قَاعِدٌ تَحْتَ جَبَلٍ يَخَافُ أَنْ يَقَعَ عَلَيْهِ وَإِنَّ الْفَاجِرَ يَرَى ذُنُوبَهُ كَذُبَابٍ مَرَّ عَلَى أَنْفِهِ فَقَالَ بِهِ هَكَذَا. ثُمَّ قَالَ: لَلَّهُ أَفْرَحُ بِتَوْبَةِ عَبْدِهِ مِنْ رَجُلٍ نَزَلَ مَنْزِلاً وَبِهِ مَهْلَكَةٌ وَمَعَهُ رَاحِلَتُهُ عَلَيْهَا طَعَامُهُ وَشَرَابُهُ فَوَضَعَ رَأْسَهُ فَنَامَ نَوْمَةً فَاسْتَيْقَظَ وَقَدْ ذَهَبَتْ رَاحِلَتُهُ حَتَّى إِذَا اشْتَدَّ عَلَيْهِ الْحَرُّ وَالْعَطَشُ أَوْ مَا شَاءَ اللَّهُ قَالَ أَرْجِعُ إِلَى مَكَانِي فَرَجَعَ فَنَامَ نَوْمَةً ثُمَّ رَفَعَ رَأْسَهُ فَإِذَا رَاحِلَتُهُ عِنْدَهُ. [رواه البخاري: ٦٣٠٨]

**2064.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﵁ iki rəvayət – birini Peyğəmbərdən ﷺ, digərini də özündən danışıb demişdir: “Mömin bəndə öz günahlarına baxanda elə düşünür ki, sanki dağın ətəyində oturmuş və az qala bu dağ onun başına uçacaqdır. Günahkar bəndə isə öz günahlarını sanki burnuna qonmuş bir milçək sanır (və elə güman edir ki, əli ilə) onu qovacaqdır.” Sonra o (Peyğəmbərin ﷺ hədisini danışıb) dedi: “Allah Öz qulunun tövbəsinə, üstündə yemək-içməyi yüklənmiş dəvəsi ilə birgə təhlükəli bir yerdə dayanan və başını yerə qoyub yatan, oyandıqda dəvəsinin qaçdığını görən, özü də bərk istiyə və susuzluğa məruz qaldıqdan sonra: “Yerimə qayıdım”- deyib geri qayıdıb bir qədər də yatan və nəhayət, oyanıb başını qaldırdıqda dəvəsini yanında görən kimsədən daha çox sevinir.” (əl-Buxari, 6308)

## 5-ci fəsil. Yatmazdan əvvəl nə demək lazımdır
## ٥ – باب: مَا يَقُولُ إِذَا نَامَ

٢٠٦٥ – عَنْ حُذَيْفَةَ بْنِ الْيَمَانِ ﵁ قَالَ: كَانَ النَّبِيُّ ﷺ إِذَا أَوَى إِلَى فِرَاشِهِ قَالَ بِاسْمِكَ أَمُوتُ وَأَحْيَا وَإِذَا قَامَ قَالَ الْحَمْدُ لِلَّهِ الَّذِي أَحْيَانَا بَعْدَ مَا أَمَاتَنَا وَإِلَيْهِ النُّشُورُ. [رواه البخاري: ٦٣١٢]

**2065.** Rəvayət edilir ki, Huzeyfə ibn Yəmən ﵁ demişdir: “Peyğəmbər ﷺ yatağına uzandıqda: “(Allahım,) Sənin adınla ölür və dirilirəm![1]”, oyandıqda isə: “Bizi öldürdükdən sonra dirildən Allaha həmd olsun. (Ölüb dirildikdən sonra isə) qayıdış Onadır![2]”– deyərdi. (əl-Buxari, 6312)

## 6-cı fəsil. Sağ böyrü üstə yatmaq
## ٦ – باب: النَّوْمُ عَلَى الشِّقِّ الأَيْمَنِ

٢٠٦٦ – عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ ﵁ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ إِذَا أَوَى إِلَى فِرَاشِهِ نَامَ عَلَى شِقِّهِ الأَيْمَنِ ثُمَّ قَالَ: اللَّهُمَّ أَسْلَمْتُ نَفْسِي إِلَيْكَ وَوَجَّهْتُ وَجْهِي إِلَيْكَ وَفَوَّضْتُ أَمْرِي إِلَيْكَ وَأَلْجَأْتُ ظَهْرِي إِلَيْكَ رَغْبَةً وَرَهْبَةً إِلَيْكَ لاَ مَلْجَأَ وَلاَ مَنْجَا مِنْكَ إِلاَّ إِلَيْكَ آمَنْتُ بِكِتَابِكَ الَّذِي أَنْزَلْتَ وَبِنَبِيِّكَ الَّذِي أَرْسَلْتَ. [رواه البخاري: ٦٣١٥]

---

[1] Transkripsiyası: Bismikə əmutu və əhya!

[2] Transkripsiyası: Əlhəmdulillahil-ləzi əhyanə bədə mə əmatənə və ileyhin-nuşur!

**2066.** Rəvayət edilir ki, Bəra ibn Azib ﷺ demişdir: “Peyğəmbər ﷺ yatağına uzanıb yatmaq istədikdə sağ böyrü üstə çevrilib deyərdi: “Allahım! Sənə ümid edərək və Səndən qorxaraq canımı Sənə təslim etdim, üzümü Sənə çevirdim, işimi Sənə həvalə etdim, kürəyimi Sənə etibar etdim. Sığınacaq və Səndən (əzabından) xilas olmaq üçün nicat yeri yalnız Sənə yönəlməkdir. Sənin nazil etdiyin Kitaba və göndərdiyin Peyğəmbərə iman gətirdim![1]” (əl-Buxari, 6315)

## 7-ci fəsil. Gecə yuxudan oyandıqda hansı dua oxunmalıdır

## ٧– باب: الدُّعَاءِ إِذَا انْتَبَهَ بِاللَّيْلِ

**٢٠٦٧** – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: بِتُّ عِنْدَ مَيْمُونَةَ فَقَامَ النَّبِيُّ ﷺ فَأَتَى حَاجَتَهُ فَغَسَلَ وَجْهَهُ وَيَدَيْهِ ثُمَّ نَامَ ثُمَّ قَامَ فَأَتَى الْقِرْبَةَ فَأَطْلَقَ شِنَاقَهَا ثُمَّ تَوَضَّأَ وُضُوءًا بَيْنَ وُضُوءَيْنِ لَمْ يُكْثِرْ وَقَدْ أَبْلَغَ فَصَلَّى فَقُمْتُ فَتَمَطَّيْتُ كَرَاهِيَةَ أَنْ يَرَى أَنِّي كُنْتُ أَتَّقِيهِ فَتَوَضَّأْتُ فَقَامَ يُصَلِّي فَقُمْتُ عَنْ يَسَارِهِ فَأَخَذَ بِأُذُنِي فَأَدَارَنِي عَنْ يَمِينِهِ فَتَتَامَّتْ صَلَاتُهُ ثَلَاثَ عَشْرَةَ رَكْعَةً ثُمَّ اضْطَجَعَ فَنَامَ حَتَّى نَفَخَ وَكَانَ إِذَا نَامَ نَفَخَ فَآذَنَهُ بِلَالٌ بِالصَّلَاةِ فَصَلَّى وَلَمْ يَتَوَضَّأْ وَكَانَ يَقُولُ فِي دُعَائِهِ: اللَّهُمَّ اجْعَلْ فِي قَلْبِي نُورًا وَفِي بَصَرِي نُورًا وَفِي سَمْعِي نُورًا وَعَنْ يَمِينِي نُورًا وَعَنْ يَسَارِي نُورًا وَفَوْقِي نُورًا وَتَحْتِي نُورًا وَأَمَامِي نُورًا وَخَلْفِي نُورًا وَاجْعَلْ لِي نُورًا. [رواه البخاري: ٦٣١٦]

**2067.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: “(Bir dəfə mən xalam) Meymunənin evində gecələdim. Gecə vaxtı Peyğəmbər ﷺ yuxudan oyanıb su başına çıxdı, sonra üzünü və əllərini yuyub yenə uzanıb yatdı. (Bir müddətdən) sonra qalxıb su tuluğuna yaxınlaşdı və onun ağzındakı ipi açıb suyu israf etmədən kamil şəkildə dəstəmaz aldı və namaza durdu. Onu güddüyümü başa düşməsin deyə, galxıb gərnəşdim, sonra dəstəmaz alıb namaz qılmaq üçün onun solunda durdum. O, qulağımdan tutub məni sağ tərəfinə keçirdi. Peyğəmbər ﷺ namazı on üç rükətə tamamladı. Sonra uzanıb yatdı və xoruldamağa başladı. (Ümumiyyətlə) o, yatarkən xoruldayardı. Sonra Bilal onu namaza çağırdı və o qalxıb dəstəmaz almadan namaz qıldı və belə dua etdi: “Allahım, qəlbimə nur saç! Gözümə nur saç və qulağıma nur saç! Sağımdan və solumdan nur saç! Başımın üstündən və ayağımın altından nur saç! Önümə və arxama nur saç! Mənim üçün nur saç!”[2] (əl-Buxari, 6316)

## 8-ci fəsil

## ٨– باب

**٢٠٦٨** – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ إِذَا أَوَى أَحَدُكُمْ إِلَى فِرَاشِهِ فَلْيَنْفُضْ فِرَاشَهُ بِدَاخِلَةِ إِزَارِهِ فَإِنَّهُ لَا يَدْرِي مَا خَلَفَهُ عَلَيْهِ ثُمَّ يَقُولُ: بِاسْمِكَ رَبِّ وَضَعْتُ جَنْبِي وَبِكَ أَرْفَعُهُ إِنْ أَمْسَكْتَ نَفْسِي فَارْحَمْهَا وَإِنْ أَرْسَلْتَهَا فَاحْفَظْهَا بِمَا تَحْفَظُ بِهِ عِبَادَكَ الصَّالِحِينَ. [رواه البخاري: ٦٣٢٠]

---

[1] Transkripsiyası: Allahummə, əsləmtu nəfsi ileykə və vəccəhtu vachi ileykə və fəvvədtu əmri ileykə və əlcətu zahri ileykə, rağbətən və rahmətən ileyk. Lə məlcə vələ məncəə minkə illə ileyk. Aməntu bikitabikəl-ləzi ənzəltə və binəbiyyikəl-ləzi ərsəlt.

[2] Transkripsiyası: Allahumməcəl fi qalbi nuran və fi bəsəri nuran və fi səmi nuran və an yəmini nuran və an yəsari nuran və fövqi nuran və təhti nuran və əmami nuran və xəlfi nuran vəcəl li nuran.

**2068.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz yatağına uzanmaq istədikdə qoy izarının iç tərəfi ilə yatağını çırpsın. Çünki o özündən sonra yatağına nəyin girdiyini bilmir. Sonra da belə desin: "Ey Rəbbim, Sənin adınla böyrümü yerə qoydum, Sənin sayəndə də onu qaldırıram. Ruhumu tutub saxlasan, ona rəhm et, onu buraxsan, əməlisaleh qullarını qoruduğun kimi onu da qoru!"[1] (əl-Buxari, 6320)

## ٩– باب: لِيَعْزِمْ الْمَسْأَلَةَ فَإِنَّهُ لاَ مُكْرِهَ لَهُ

## 9-cu fəsil. Qoy (hər kəs Allaha dua etdikdə) qətiyyətlə dua etsin. Çünki heç kəs Onu nəyəsə vadar edə bilməz

٢٠٦٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: لاَ يَقُولَنَّ أَحَدُكُمْ: اللَّهُمَّ اغْفِرْ لِي إِنْ شِئْتَ اللَّهُمَّ ارْحَمْنِي إِنْ شِئْتَ لِيَعْزِمْ الْمَسْأَلَةَ فَإِنَّهُ لاَ مُكْرِهَ لَهُ. [رواه البخاري: ٦٣٣٨]

**2069.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən heç kəs deməsin ki: "Allahım, əgər istəyirsənsə, məni bağışla, Allahım, əgər istəyirsənsə, mənə rəhm et!" Qoy hər kəs qətiyyətlə dua etsin. Çünki heç kəs Allahı nəyəsə vadar edə bilməz." (əl-Buxari, 6338)

## ١٠– باب: يُسْتَجَابُ لِلْعَبْدِ مَا لَمْ يَعْجَلْ

## 10-cu fəsil. (Duasının qəbul olunmasına) tələsməyən kimsənin duası qəbul olar

٢٠٧٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: يُسْتَجَابُ لأَحَدِكُمْ مَا لَمْ يَعْجَلْ يَقُولُ دَعَوْتُ فَلَمْ يُسْتَجَبْ لِي. [رواه البخاري: ٦٣٤٠]

**2070.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən dua etdim, amma duam qəbul olmadı" deməyən və (duasının qəbul olunmasına) tələsməyən kimsənin duası qəbul olar." (əl-Buxari, 6340)

## ١١– باب: الدُّعَاءُ عِنْدَ الْكَرْبِ

## 11-ci fəsil. Sıxıntı anında oxunan dua

٢٠٧١ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ كَانَ يَقُولُ عِنْدَ الْكَرْبِ لاَ إِلَهَ إِلاَّ اللَّهُ الْعَظِيمُ الْحَلِيمُ لاَ إِلَهَ إِلاَّ اللَّهُ رَبُّ الْعَرْشِ الْعَظِيمِ لاَ إِلَهَ إِلاَّ اللَّهُ رَبُّ السَّمَوَاتِ وَرَبُّ الأَرْضِ وَرَبُّ الْعَرْشِ الْكَرِيمِ. [رواه البخاري: ٦٣٤٦]

**2071.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ sıxıntı anında deyərdi: "Əzəmətli, Həlim olan Allahdan başqa məbud yoxdur! Əzəmətli Ərşin Rəbbi olan Allahdan başqa məbud yoxdur! Göylərin Rəbbi, yerin Rəbbi və kərəmətli Ərşin Rəbbi olan Allahdan başqa məbud yoxdur!"[2] (əl-Buxari, 6346)

---

[1] Transkripsiyası: Bismikə rabbi vədətu cənbi və bikə ərfəuhu. İn əmsəktə nəfsi fərhəmhə və in ərsəltəhə fəhfəzhə bimə təhfəzu bihi ibadəkəs-salihin.

[2] Transkripsiyası: Lə ilahə illəllahul-azimul-həlim, lə ilahə illəllahu Rabbul-arşil-azim, lə ilahə illəllahu Rabbus-səməvati və Rabbul-ardı və Rabbul-arşil-kərim.

## 12-ci fəsil. Bəlanın məşəqqətindən Allaha sığınmaq

## ١٢– باب: التَّعَوُّذُ مِنْ جَهْدِ الْبَلاَءِ

٢٠٧٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَتَعَوَّذُ مِنْ جَهْدِ الْبَلاَءِ وَدَرَكِ الشَّقَاءِ وَسُوءِ الْقَضَاءِ وَشَمَاتَةِ الأَعْدَاءِ. قَالَ سُفْيَانُ الْحَدِيثُ ثَلاَثٌ زِدْتُ أَنَا وَاحِدَةً لاَ أَدْرِي أَيَّتُهُنَّ هِيَ. [رواه البخاري: ٦٣٤٧]

**2072.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bəlanın məşəqqətindən, bədbəxt olmaqdan, pis taledən və düşmənlərin bədxahlığından Allaha sığınardı."

Süfyan demişdir: "Hədisdə yalnız üç şey qeyd olunmuşdur, dördüncüsünü isə mən özümdən əlavə etmişəm. Amma hansı sözü əlavə etdiyim yadımda deyil.[1]" (əl-Buxari, 6347)

## 13-cü fəsil. Peyğəmbərin ﷺ: "(Allahım,) kimin xətrinə dəymişəmsə, bunu onun (günahlardan) təmizlənməsi və bağışlanması üçün səbəb et!" sözü

## ١٣– باب: قَوْلُ النَّبِيِّ ﷺ مَنْ آذَيْتُهُ فَاجْعَلْهُ لَهُ زَكَاةً وَرَحْمَةً

٢٠٧٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ: اللَّهُمَّ فَأَيُّمَا مُؤْمِنٍ سَبَبْتُهُ فَاجْعَلْ ذَلِكَ لَهُ قُرْبَةً إِلَيْكَ يَوْمَ الْقِيَامَةِ. [رواه البخاري: ٦٣٦١]

**2073.** Əbu Hureyra ﷺ rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Allahım, hansı bir mömini təhqir etmişəmsə, bunu Qiyamət günü onun Sənə yaxınlaşması üçün bir vasitə et!" (əl-Buxari, 6361)

## 14-cü fəsil. Xəsislikdən Allaha sığınmaq

## ١٤– باب: التَّعَوُّذُ مِنَ الْبُخْلِ

٢٠٧٤ – عَنْ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ﷺ أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَأْمُرُ بِهَؤُلاَءِ الكَلِمَاتِ: اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْبُخْلِ وَأَعُوذُ بِكَ مِنَ الْجُبْنِ وَأَعُوذُ بِكَ أَنْ أُرَدَّ إِلَى أَرْذَلِ الْعُمُرِ وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الدُّنْيَا وَأَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ. [رواه البخاري: ٦٣٦٥]

**2074.** Səd ibn Əbu Vəqqas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bu kəlmələri deməyi əmr edərdi: "Allahım, xəsislikdən Sənə sığınıram, qorxaqlıqdan Sənə sığınıram, qocalığın ən düşkün çağına çatmaqdan Sənə sığınıram, dünyanın fitnəsindən Sənə sığınıram, qəbir əzabından Sənə sığınıram!"[2] (əl-Buxari, 6365)

---

[1] İbn Həcər bu xüsusda olan digər hədisləri bir araya gətirdikdən sonra demişdir ki, Süfyan bu hədisə: "...düşmənlərin bədxahlığından" sözünü əlavə etmişdir.

[2] Transkripsiyası: Allahummə inni əuzu bikə minəl-buxli və əuzu bikə minəl-cubni və əuzu bikə ən uraddə ilə ərzəlil-umuri və əuzu bikə min fitnətid-dunya və əuzu bikə min əzabil-qəbr.

## ١٥- باب: التَّعَوُّذُ مِنَ الْمَأْثَمِ وَالْمَغْرَمِ

## 15-ci fəsil. Günahdan və borcdan Allaha sığınmaq

٢٠٧٥ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَقُولُ: اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْكَسَلِ وَالْهَرَمِ وَالْمَأْثَمِ وَالْمَغْرَمِ وَمِنْ فِتْنَةِ الْقَبْرِ وَعَذَابِ الْقَبْرِ وَمِنْ فِتْنَةِ النَّارِ وَعَذَابِ النَّارِ وَمِنْ شَرِّ فِتْنَةِ الْغِنَى وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْفَقْرِ وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ اللَّهُمَّ اغْسِلْ عَنِّي خَطَايَايَ بِمَاءِ الثَّلْجِ وَالْبَرَدِ وَنَقِّ قَلْبِي مِنَ الْخَطَايَا كَمَا نَقَّيْتَ الثَّوْبَ الأَبْيَضَ مِنَ الدَّنَسِ وَبَاعِدْ بَيْنِي وَبَيْنَ خَطَايَايَ كَمَا بَاعَدْتَ بَيْنَ الْمَشْرِقِ وَالْمَغْرِبِ. [رواه البخاري: ٦٣٦٨]

**2075.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ belə dua edərdi: "Allahım, tənbəllikdən, qartımaqdan, günahdan, borcdan, qəbir fitnəsindən, qəbir əzabından, Cəhənnəm fitnəsindən, Cəhənnəm əzabından və var-dövlət fitnəsinin şərindən Sənə sığınıram! Yoxsulluğun fitnəsindən Sənə sığınıram! Məsihid-dəccalın fitnəsindən Sənə sığınıram! Allahım, mənim günahlarımı qar və dolu suyu ilə yu, ağ paltarı kirdən təmizlədiyin kimi qəlbimi də günahlardan təmizlə və məğriblə məşriqin arasını uzaqlaşdırdığın kimi məni də günahlarımdan uzaqlaşdır!"[1] (əl-Buxari, 6368)

## ١٦- باب: قَوْلُ النَّبِيِّ ﷺ رَبَّنَا آتِنَا فِي الدُّنْيَا حَسَنَةً

## 16-cı fəsil. Peyğəmbərin ﷺ: "Ey Rəbbimiz, bizə dünyada gözəl nemətlər ver..." sözü

٢٠٧٦ – عَنْ أَنَسٍ رضي الله عنه قَالَ: كَانَ أَكْثَرُ دُعَاءِ النَّبِيِّ ﷺ اللَّهُمَّ رَبَّنَا آتِنَا فِي الدُّنْيَا حَسَنَةً وَفِي الآخِرَةِ حَسَنَةً وَقِنَا عَذَابَ النَّارِ. [رواه البخاري: ٦٣٨٩]

**2076.** Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ çox vaxt belə dua edərdi: "Ey Allah! Ey Rəbbimiz! Bizə dünyada da, axirətdə də gözəl (nemətlər) bəxş et və bizi Cəhənnəm əzabından qoru!"[2] (əl-Buxari, 6389)

## ١٧- باب: قَوْلُ النَّبِيِّ ﷺ اللَّهُمَّ اغْفِرْ لِي مَا قَدَّمْتُ وَمَا أَخَّرْتُ

## 17-ci fəsil. Peyğəmbərin ﷺ: "Allahım, əvvəl etdiyim və sonra edəcəyim (günahlarımı) bağışla..." sözü

٢٠٧٧ – عَنْ أَبِي مُوسَى رضي الله عنه عَنِ النَّبِيِّ ﷺ أَنَّهُ كَانَ يَدْعُو بِهَذَا الدُّعَاءِ: رَبِّ اغْفِرْ لِي خَطِيئَتِي وَجَهْلِي وَإِسْرَافِي فِي أَمْرِي كُلِّهِ وَمَا أَنْتَ أَعْلَمُ بِهِ مِنِّي اللَّهُمَّ اغْفِرْ لِي هَزْلِي وَ جِدِّي وَ خَطَايَ وَعَمْدِي وَكُلُّ ذَلِكَ عِنْدِي اللَّهُمَّ

---

[1] Transkripsiyası: Allahummə, inni əuzu bikə minəl-kəsəli, vəl-hərəmi, vəl-məsəmi, vəl-məğrəmi və min fitnətil qəbri və əzabil-qəbri və min fitnətin-nari və əzabin-nari və min şərri fitnətil-ğina və əuzu bikə min fitnətil-fəqri və əuzu bikə min fitnətil-məsihid-dəccal. Allahumməğsil anni xətayaya bimais-səlci vəl-bərədi və nəqqi qəlbi minəl-xətaya kəmə nəqqaytəs-sovbəl-əbyədə minəd-dənəsi və baid beyni və beynə xətayaya kəmə baədtə beynəl-məşriqi vəl-məğribi.

[2] Transkripsiyası: Allahummə Rabbənə atinə fid-dunya həsənətən və fil-axirəti həsənətən və qina əzabən-nar.

اغْفِرْ لِي مَا قَدَّمْتُ وَمَا أَخَّرْتُ وَمَا أَسْرَرْتُ وَمَا أَعْلَنْتُ أَنْتَ الْمُقَدِّمُ وَأَنْتَ الْمُؤَخِّرُ وَأَنْتَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ. [رواه البخاري: ٦٣٩٩]

**2077.** Əbu Musa ﵁ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ belə dua edərdi: "Ey Rəbbim, mənim günahımı, bilmədiklərimi, bütün işlərimdə israfa yol verməyimi və məndən daha yaxşı bildiyin şeyləri bağışla. Allahım, mənim zarafatla və ya ciddi olaraq, səhvən və ya bilərəkdən etdiyim xətalarımı bağışla! Bunların hamısının məndə olması mümkündür. Allahım, mənim əvvəl etdiyim, sonra edəcəyim, gizlin saxladığım və üzə çıxardığım (pis əməllərimi) bağışla! Əvvələ çəkən də Sənsən, təxirə salan da Sənsən və Sən hər şeyə qadirsən"[1]. (əl-Buxari, 6399)

## 18-ci fəsil. Təhlil etməyin fəziləti

## ١٨ – باب: فَضْلُ التَّهْلِيلِ

٢٠٧٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: مَنْ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ فِي يَوْمٍ مِائَةَ مَرَّةٍ كَانَتْ لَهُ عَدْلَ عَشْرِ رِقَابٍ وَكُتِبَ لَهُ مِائَةُ حَسَنَةٍ وَمُحِيَتْ عَنْهُ مِائَةُ سَيِّئَةٍ وَكَانَتْ لَهُ حِرْزًا مِنْ الشَّيْطَانِ يَوْمَهُ ذَلِكَ حَتَّى يُمْسِيَ وَلَمْ يَأْتِ أَحَدٌ بِأَفْضَلَ مِمَّا جَاءَ إِلاَّ رَجُلٌ عَمِلَ أَكْثَرَ مِنْهُ. [رواه البخاري: ٦٤٠٣]

**2078.** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim gün ərzində yüz dəfə: "Allahdan başqa məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Mülk Onundur və həmd Ona məxsusdur və O hər şeyə Qadirdir![2]"- desə, on kölə azad etmiş sayılar, üstəlik ona yüz savab yazılar və onun yüz günahı silinər, (bundan başqa bu dualar) həmin gün axşama qədər onu şeytandan qoruyar və (bu duanı) ondan çox deyən kimsə istisna olmaqla heç kəs onun gətirdiyindən əfzəl başqa bir şey gətirə bilməz." (əl-Buxari, 6403)

٢٠٧٩ – عَنْ أَبِي أَيُّوبَ الأَنْصَارِيِّ وَ ابْنِ مَسْعُودٍ ﵄ عَنِ النَّبِيِّ ﷺ قَالَ: مَنْ قَالَ عَشْرًا كَانَ كَمَنْ أَعْتَقَ رَقَبَةً مِنْ وَلَدِ إِسْمَاعِيلَ. [رواه البخاري: ٦٤٠٤]

**2079.** Əbu Əyyub əl-Ənsari və ibn Məsud ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim (bunu[3]) on dəfə desə, İsmail nəslindən bir kölə azad etmiş sayılar." (əl-Buxari, 6404)

## 19-cu fəsil. "Subhənallah!" deməyin fəziləti

## ١٩ – باب: فَضْلُ التَّسْبِيحِ

٢٠٨٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: مَنْ قَالَ سُبْحَانَ اللَّهِ وَبِحَمْدِهِ فِي يَوْمٍ مِائَةَ مَرَّةٍ حُطَّتْ خَطَايَاهُ وَإِنْ كَانَتْ مِثْلَ زَبَدِ الْبَحْرِ. [رواه البخاري: ٦٤٠٥]

---

[1] Transkripsiyası: Rabbiğ-firli xətiəti və cəhli və israfi fi əmri kullihi və mə əntə ələmu bihi minni. Allahumməğ-firli həzli və ciddi və xətaya və əmdi və kullu zalikə indi. Allahumməğ-firli mə qaddəmtu və mə əxxərtu və mə əsrərtu və mə ələntu, əntəl-muqəddimu və əntəl-muəxxiru və əntə alə kulli şeyin qədir.

[2] Transkripsiyası: Lə ilahə illəllahu vəhdəhu lə şərikə ləhu, ləhul-mulku və ləhul-həmdu və huvə alə kulli şeyin qədir.

[3] Əvvəlki dua.

**2080.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim gün ərzində yüz dəfə: "Allah pak və müqəddəsdir! Allaha həmd olsun!" [1]– desə, günahları dəniz köpüyü qədər olsa belə silinər." (əl-Buxari, 6405)

## 20-ci fəsil. Allahı ﷻ zikr etməyin fəziləti

## ٢٠– باب: فَضْلُ ذِكْرِ اللَّهِ ﷻ

٢٠٨١ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ مَثَلُ الَّذِي يَذْكُرُ رَبَّهُ وَالَّذِي لاَ يَذْكُرُ رَبَّهُ مَثَلُ الْحَيِّ وَالْمَيِّتِ. [رواه البخاري: ٦٤٠٧]

**2081.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Rəbbini yad edənlə yad etməyən kimsənin misalı diri ilə ölünün misalına bənzəyir." (əl-Buxari, 6407)

٢٠٨٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ إِنَّ لِلَّهِ مَلاَئِكَةً يَطُوفُونَ فِي الطُّرُقِ يَلْتَمِسُونَ أَهْلَ الذِّكْرِ فَإِذَا وَجَدُوا قَوْمًا يَذْكُرُونَ اللَّهَ تَنَادَوْا هَلُمُّوا إِلَى حَاجَتِكُمْ قَالَ فَيَحُفُّونَهُمْ بِأَجْنِحَتِهِمْ إِلَى السَّمَاءِ الدُّنْيَا قَالَ فَيَسْأَلُهُمْ رَبُّهُمْ وَهُوَ أَعْلَمُ مِنْهُمْ مَا يَقُولُ عِبَادِي قَالُوا يَقُولُونَ يُسَبِّحُونَكَ وَيُكَبِّرُونَكَ وَيَحْمَدُونَكَ وَيُمَجِّدُونَكَ قَالَ فَيَقُولُ هَلْ رَأَوْنِي قَالَ فَيَقُولُونَ لاَ وَاللَّهِ مَا رَأَوْكَ قَالَ فَيَقُولُ وَكَيْفَ لَوْ رَأَوْنِي قَالَ يَقُولُونَ لَوْ رَأَوْكَ كَانُوا أَشَدَّ لَكَ عِبَادَةً وَأَشَدَّ لَكَ تَمْجِيدًا وَتَحْمِيدًا وَأَكْثَرَ لَكَ تَسْبِيحًا قَالَ يَقُولُ فَمَا يَسْأَلُونِي قَالَ يَسْأَلُونَكَ الْجَنَّةَ قَالَ يَقُولُ وَهَلْ رَأَوْهَا قَالَ يَقُولُونَ لاَ وَاللَّهِ يَا رَبِّ مَا رَأَوْهَا قَالَ يَقُولُ فَكَيْفَ لَوْ أَنَّهُمْ رَأَوْهَا قَالَ يَقُولُونَ لَوْ أَنَّهُمْ رَأَوْهَا كَانُوا أَشَدَّ عَلَيْهَا حِرْصًا وَأَشَدَّ لَهَا طَلَبًا وَأَعْظَمَ فِيهَا رَغْبَةً قَالَ فَمِمَّ يَتَعَوَّذُونَ قَالَ يَقُولُونَ مِنَ النَّارِ قَالَ يَقُولُ وَهَلْ رَأَوْهَا قَالَ يَقُولُونَ لاَ وَاللَّهِ يَا رَبِّ مَا رَأَوْهَا قَالَ يَقُولُ فَكَيْفَ لَوْ رَأَوْهَا قَالَ يَقُولُونَ لَوْ رَأَوْهَا كَانُوا أَشَدَّ مِنْهَا فِرَارًا وَأَشَدَّ لَهَا مَخَافَةً قَالَ فَيَقُولُ فَأُشْهِدُكُمْ أَنِّي قَدْ غَفَرْتُ لَهُمْ قَالَ يَقُولُ مَلَكٌ مِنَ الْمَلاَئِكَةِ فِيهِمْ فُلاَنٌ لَيْسَ مِنْهُمْ إِنَّمَا جَاءَ لِحَاجَةٍ قَالَ هُمُ الْجُلَسَاءُ لاَ يَشْقَى بِهِمْ جَلِيسُهُمْ. [رواه البخاري: ٦٤٠٨]

**2082.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahın yollarda dolaşıb (Allahı) yad edən insanları axtaran mələkləri vardır. Onlar Allahı yad edən bir camaat gördükləri zaman bir-birilərini çağırıb: "Axtardığınızın yanına gəlin!"– deyirlər. Sonra onlar bu camaatı öz qanadları ilə dünya səmasınadək əhatəyə alırlar. Elə həmin vaxt Rəbbi mələklərdən – (hər şeyi) onlardan daha yaxşı bildiyi halda – soruşur: "Qullarım nə deyirlər?" (Mələklər): "Onlar Sənin şəninə təriflər deyir, Səni uca tutur, Səni həmd-səna ilə təqdis edir və Səni həddən artıq tərifləyirlər"– deyə cavab verirlər. (Allah) soruşur: "Məgər onlar Məni görüblərmi?" (Mələklər): "Xeyr, vallahi ki, onlar Səni görməyiblər"– deyirlər. (Allah) soruşur: "Bəs Məni görsəydilər, necə (olardı)?" (Mələklər) deyirlər: "Əgər onlar Səni görsəydilər, bundan da çox Sənə ibadət edər, Səni tərifləyər, Səni həmd-səna ilə təqdis edər və Sənin şənini uca tutardılar." (Allah) soruşur: "Onlar Məndən nə istəyirlər?" (Mələklər) deyirlər: "Onlar Səndən Cənnəti istəyirlər." (Allah) soruşur: "Məgər onlar Cənnəti görüblərmi?" (Mələklər) deyirlər: "Xeyr, ya Rəbb, vallahi ki, onlar Cənnəti görməyiblər." (Allah) soruşur: "Bəs onu görsəydilər, necə (olar-

[1] Transkripsiyası: Subhanəllahi və bihəmdihi.

dı)?" (Mələklər) deyirlər: "Əgər onu görsəydilər, daha əzmlə ona can atar, daha inadla onu diləyər və daha çox rəğbətlə onu arzulayardılar." (Allah) soruşur: "Onlar nədən (Mənə) sığınırlar?" (Mələklər): "Cəhənnəm odundan"– deyirlər. (Allah) soruşur: "Məgər onlar Cəhənnəmi görüblərmi?" (Mələklər) deyirlər: "Xeyr, ya Rəbb, vallahi ki, onlar Cəhənnəmi görməyiblər." (Allah) soruşur: "Bəs onu görsəydilər, necə (olardı)?" (Mələklər) deyirlər: "Əgər onu görsəydilər, ondan daha uzağa qaçmağa çalışar və ondan daha çox çəkinərdilər." (Allah) buyurur: "Şahid olun ki, Mən onları bağışladım!" Bu vaxt mələklərdən biri deyir: "Bu camaatın arasında olan filankəs onlarla (yoldaşlıq edən kimsələrdən) deyildir, sadəcə olaraq öz ehtiyacı üzündən ora gəlmişdir." (Onda Allah) buyurur: "Bunlar elə insanlardır ki, onlarla oturub-duran adam bədbəxt olmaz." (əl-Buxari, 6408)

# ٨١ – كِتَابُ الرِّقَاقِ

# 81 – (Qəlbi) yumşaldan (əməllər) kitabı

## ١– باب: لاَ عَيْشَ إِلاَّ عَيْشُ الآخِرَةِ

## 1-ci fəsil. Həyat məhz axirət həyatıdır

٢٠٨٣ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ النَّبِيُّ ﷺ نِعْمَتَانِ مَغْبُونٌ فِيهِمَا كَثِيرٌ مِنَ النَّاسِ الصِّحَّةُ وَالْفَرَاغُ. [رواه البخاري: ٦٤١٢]

**2083.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İki nemət vardır ki, insanların çoxu onları layiqincə qiymətləndirmir. (Bunlar) sağlamlıq və boş vaxtdır!" (əl-Buxari, 6412)

## ٢– باب: قَوْلُ النَّبِيِّ ﷺ كُنْ فِي الدُّنْيَا كَأَنَّكَ غَرِيبٌ أَوْ عَابِرُ سَبِيلٍ

## 2-ci fəsil. Peyğəmbərin ﷺ: "Dünyada bir qərib, yaxud bir müsafir kimi ol!" sözü

٢٠٨٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما قَالَ: أَخَذَ رَسُولُ اللَّهِ ﷺ بِمَنْكِبِي فَقَالَ: كُنْ فِي الدُّنْيَا كَأَنَّكَ غَرِيبٌ أَوْ عَابِرُ سَبِيلٍ، وَكَانَ ابْنُ عُمَرَ يَقُولُ إِذَا أَمْسَيْتَ فَلاَ تَنْتَظِرْ الصَّبَاحَ وَإِذَا أَصْبَحْتَ فَلاَ تَنْتَظِرْ الْمَسَاءَ وَخُذْ مِنْ صِحَّتِكَ لِمَرَضِكَ وَمِنْ حَيَاتِكَ لِمَوْتِكَ. [رواه البخاري: ٦٤١٦]

**2084.** Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ mənim çiynimdən tutub dedi: "Dünyada bir qərib, yaxud bir müsafir kimi ol!"

(Hədisi danışan ravilərdən biri) demişdir: "İbn Ömər deyərdi: "Axşama çıxdığın zaman səhərə sağ qalacağına, səhərə çıxdığın zaman da axşama sağ qalacağına arxayın olma! Xəstələnənədək sağlamlığından və ölənədək həyatından istifadə et!" (əl-Buxari, 6416)

## ٣– باب: فِي الأَمَلِ وَطُولِهِ

## 3-cü fəsil. Arzuların çox olması haqqında

٢٠٨٥ – عَنْ عَبْدِ اللَّهِ رضي الله عنه قَالَ: خَطَّ النَّبِيُّ ﷺ خَطًّا مُرَبَّعًا وَخَطَّ خَطًّا فِي الْوَسَطِ خَارِجًا مِنْهُ وَخَطَّ خُطَطًا صِغَارًا إِلَى هَذَا الَّذِي فِي الْوَسَطِ مِنْ جَانِبِهِ الَّذِي فِي الْوَسَطِ وَقَالَ هَذَا الإِنْسَانُ وَهَذَا أَجَلُهُ مُحِيطٌ بِهِ أَوْ قَدْ أَحَاطَ بِهِ وَهَذَا الَّذِي هُوَ خَارِجٌ أَمَلُهُ وَهَذِهِ الْخُطَطُ الصِّغَارُ الأَعْرَاضُ فَإِنْ أَخْطَأَهُ هَذَا نَهَشَهُ هَذَا وَإِنْ أَخْطَأَهُ هَذَا نَهَشَهُ هَذَا. [رواه البخاري: ٦٤١٧]

**2085.** Rəvayət edilir ki, Abdullah (ibn Məsud) رضي الله عنه demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ (yerdə) dördbucaq cızdı. (Sonra) onun ortasından xaricinə düz bir xətt çəkdi. (Daha sonra dördbucağın içindəki) həmin düz xəttə kimi qısa-qısa xətlər cızdı. (Bundan sonra belə) buyurdu: "Bu, insandır; bu, onu əhatəsinə almış əcəli, bu çölə çıxan xətt onun arzuları, bu qısa xətlər isə (qədərinə ya-

zılmış) müsibətlərdir. Əgər bu onu haqlamasa, o biri onu yaxalayar, o biri onu haqlamasa, bu biri onu yaxalayar." (əl-Buxari, 6417)



٢٠٨٦ – عَنْ أَنَسٍ ﷺ قَالَ: خَطَّ النَّبِيُّ ﷺ خُطُوطًا فَقَالَ: هَذَا الأَمَلُ وَهَذَا أَجَلُهُ فَبَيْنَمَا هُوَ كَذَلِكَ إِذْ جَاءَهُ الْخَطُّ الأَقْرَبُ. [رواه البخاري: ٦٤١٨]

**2086.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ yerdə bir neçə xətt çızdı, sonra dedi: "Bu, (insanın) arzuları, bu da onun əcəlidir. İnsan arzularla yaşadığı bir vaxtda yaxın olan əcəli onu haqlayar." (əl-Buxari, 6418)

## 4-cü fəsil. Altmış yaşına qədər yaşamış kimsənin Allahın hüzurunda üzürü qəbul olmaz

## ٤ – باب: مَنْ بَلَغَ سِتِّينَ سَنَةً فَقَدْ أَعْذَرَ اللَّهُ إِلَيْهِ فِي الْعُمُرِ

٢٠٨٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: أَعْذَرَ اللَّهُ إِلَى امْرِئٍ أَخَّرَ أَجَلَهُ حَتَّى بَلَّغَهُ سِتِّينَ سَنَةً. [رواه البخاري: ٦٤١٩]

**2087.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Altmış yaşına kimi ömrü uzanmış kimsənin Allahın hüzurunda üzür diləmək haqqı olmayacaq." (əl-Buxari, 6419)

٢٠٨٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: لاَ يَزَالُ قَلْبُ الْكَبِيرِ شَابًّا فِي اثْنَتَيْنِ فِي حُبِّ الدُّنْيَا وَطُولِ الأَمَلِ. [رواه البخاري: ٦٤٢٠]

**2088.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Yaşlı adamın qəlbi cavan olaraq hər zaman iki şeylə – dünya sevgisi və arzularla dolu olur." (əl-Buxari, 6420)

## 5-ci fəsil. Allahın Üzünü diləyərək yerinə yetirilən əməl

## ٥ – باب: الْعَمَلُ الَّذِي يُبْتَغَى بِهِ وَجْهُ اللَّهِ

٢٠٨٩ – عَنْ عِتْبَانَ بْنِ مَالِك الأَنْصارِيِّ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ: لَنْ يُوَافِيَ عَبْدٌ يَوْمَ الْقِيَامَةِ يَقُولُ لاَ إِلَهَ إِلاَّ اللَّهُ يَبْتَغِي بِهِ وَجْهَ اللَّهِ إِلاَّ حَرَّمَ اللَّهُ عَلَيْهِ النَّارَ. [رواه البخاري: ٦٤٢٣]

**2089.** İtban ibn Malik əl-Ənsari ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahın Üzünü diləyərək "lə ilahə illəllah" deyən bir bəndəyə Qiyamət günü Allah Cəhənnəm odunu haram edər." (əl-Buxari, 6423)

٢٠٩٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: يَقُولُ اللَّهُ تَعَالَى: مَا لِعَبْدِي الْمُؤْمِنِ عِنْدِي جَزَاءٌ إِذَا قَبَضْتُ صَفِيَّهُ مِنْ أَهْلِ الدُّنْيَا ثُمَّ احْتَسَبَهُ إِلاَّ الْجَنَّةُ. [رواه البخاري: ٦٤٢٤]

**2090.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Uca Allah buyurur: "Mən mömin qulumun sevdiyi yaxın bir adamının canını aldıqdan sonra o

buna (səbir edib axirətdə əvəzini alacağına) ümid edərsə, Mənim ona verəcəyim mükafat ancaq Cənnət olar." (əl-Buxari, 6424)

## 6-cı fəsil. Əməlisaleh insanların dünyadan köçməsi

## ٦- باب: ذَهَابُ الصَّالِحِينَ

٢٠٩١ - عَنْ مِرْدَاسٍ الأَسْلَمِيِّ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ يَذْهَبُ الصَّالِحُونَ الأَوَّلُ فَالأَوَّلُ وَيَبْقَى حُفَالَةٌ كَحُفَالَةِ الشَّعِيرِ أَوْ التَّمْرِ لاَ يُبَالِيهِمْ اللَّهُ بَالَةً. [رواه البخاري: ٦٤٣٤]

**2091.** Mirdas əl-Əsləmi ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əməlisaleh insanlar bir-birinin ardınca bu dünyadan köçəcəklər. Axıra isə arpa və ya xurma tullantısı qədər xeyirsiz adamlar qalacaqlar. Bu adamlara Allah dəyər verməyəcəkdir." (əl-Buxari, 6434)

## 7-ci fəsil. Mal-dövlət fitnəsinin nəyindən çəkinmək gərəkdir

## ٧- باب: مَا يُتَّقَى مِنْ فِتْنَةِ الْمَالِ

٢٠٩٢ - عَنْ ابْنَ عَبَّاسٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: لَوْ كَانَ لاِبْنِ آدَمَ وَادِيَانِ مِنْ مَالٍ لاَبْتَغَى ثَالِثًا وَلاَ يَمْلأُ جَوْفَ ابْنِ آدَمَ إِلاَّ التُّرَابُ وَيَتُوبُ اللَّهُ عَلَى مَنْ تَابَ. [رواه البخاري: ٦٤٣٦]

**2092.** Rəvayət edilir ki, ibn Abbas ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Əgər Adəm övladının iki vadi dolusu mal-dövləti olsaydı, təbii ki, üçüncüsünü də arzulayardı. Adəm övladının içini ancaq torpaq doydurar. (Amma) Allah tövbə edən kimsənin tövbəsini qəbul edər." (əl-Buxari, 6436)

## 8-ci fəsil. (Kim) malından əvvəlcədən nə xərcləyərsə, özü üçün xərcləmiş olar

## ٨- باب: مَا قَدَّمَ مِنْ مَالِهِ فَهُوَ لَهُ

٢٠٩٣ - عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ أَيُّكُمْ مَالُ وَارِثِهِ أَحَبُّ إِلَيْهِ مِنْ مَالِهِ قَالُوا: يَا رَسُولَ اللَّهِ مَا مِنَّا أَحَدٌ إِلاَّ مَالُهُ أَحَبُّ إِلَيْهِ قَالَ فَإِنَّ مَالَهُ مَا قَدَّمَ وَمَالُ وَارِثِهِ مَا أَخَّرَ. [رواه البخاري: ٦٤٤٢]

**2093.** Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hansı birinizə varisinin malı öz malından daha sevimlidir?" (Əshabələr) dedilər: "Ya Rəsulullah, aramızda elə bir kimsə yoxdur ki, öz malı ona varisinin malından daha sevimli olmasın." Peyğəmbər ﷺ buyurdu: "Həqiqətən, hər kəsin qabaqcadan (həyatda ikən) xərclədiyi onun öz malı, sonraya saxladığı isə varisinin malıdır.[1]" (əl-Buxari, 6442)

[1] Hər kəs Allah yolunda xərclədiyinin əvəzini Qiyamət günü artıqlaması ilə alacaq, bu mal-dövlət axırda yenə onun özünə qismət olacaq, yığıb saxladığı isə gec-tez varislərə nəsib olacaqdır. Aişə ﷺ rəvayət etmişdir ki, (bir dəfə onlar) bir qoç kəsib (Allah yolunda) payladılar. Sonra Peyğəmbər ﷺ gəlib soruşdu ki: "(Özümüzə) nə qaldı?" Aişə ﷺ: "Onun bir kürəyi qaldı?"- deyə cavab verdi. Onda Peyğəmbər ﷺ dedi: "(Xeyr, bizə) payladığımız qaldı" (Səhih Sunən ət-Tirmizi, 2470 və Səhih Tərğib vət-Tərhib, 859).

## 9-cu fəsil. Peyğəmbər ﷺ və onun əshabələri necə yaşamışlar və bu dünyaya necə rəğbət bəsləməmişlər?

## ٩– باب: كَيْفَ كَانَ عَيْشُ النَّبِيِّ ﷺ وَأَصْحَابِهِ وَتَخَلِّيهِمْ مِنْ الدُّنْيَا

٢٠٩٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ كَانَ يَقُولُ آللَّهِ الَّذِي لاَ إِلَهَ إِلاَّ هُوَ إِنْ كُنْتُ لأَعْتَمِدُ بِكَبِدِي عَلَى الأَرْضِ مِنْ الْجُوعِ وَإِنْ كُنْتُ لأَشُدُّ الْحَجَرَ عَلَى بَطْنِي مِنْ الْجُوعِ وَلَقَدْ قَعَدْتُ يَوْمًا عَلَى طَرِيقِهِمْ الَّذِي يَخْرُجُونَ مِنْهُ فَمَرَّ أَبُو بَكْرٍ فَسَأَلْتُهُ عَنْ آيَةٍ مِنْ كِتَابِ اللَّهِ مَا سَأَلْتُهُ إِلاَّ لِيُشْبِعَنِي فَمَرَّ وَلَمْ يَفْعَلْ ثُمَّ مَرَّ بِي عُمَرُ فَسَأَلْتُهُ عَنْ آيَةٍ مِنْ كِتَابِ اللَّهِ مَا سَأَلْتُهُ إِلاَّ لِيُشْبِعَنِي فَمَرَّ فَلَمْ يَفْعَلْ ثُمَّ مَرَّ بِي أَبُو الْقَاسِمِ ﷺ فَتَبَسَّمَ حِينَ رَآنِي وَعَرَفَ مَا فِي نَفْسِي وَمَا فِي وَجْهِي ثُمَّ قَالَ يَا أَبَا هِرٍّ قُلْتُ لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ قَالَ الْحَقْ وَمَضَى فَتَبِعْتُهُ فَدَخَلَ فَاسْتَأْذَنَ فَأَذِنَ لِي فَدَخَلَ فَوَجَدَ لَبَنًا فِي قَدَحٍ فَقَالَ مِنْ أَيْنَ هَذَا اللَّبَنُ قَالُوا أَهْدَاهُ لَكَ فُلاَنٌ أَوْ فُلاَنَةُ قَالَ أَبَا هِرٍّ قُلْتُ لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ قَالَ الْحَقْ إِلَى أَهْلِ الصُّفَّةِ فَادْعُهُمْ لِي قَالَ وَأَهْلُ الصُّفَّةِ أَضْيَافُ الإِسْلاَمِ لاَ يَأْوُونَ إِلَى أَهْلٍ وَلاَ مَالٍ وَلاَ عَلَى أَحَدٍ إِذَا أَتَتْهُ صَدَقَةٌ بَعَثَ بِهَا إِلَيْهِمْ وَلَمْ يَتَنَاوَلْ مِنْهَا شَيْئًا وَإِذَا أَتَتْهُ هَدِيَّةٌ أَرْسَلَ إِلَيْهِمْ وَأَصَابَ مِنْهَا وَأَشْرَكَهُمْ فِيهَا فَسَاءَنِي ذَلِكَ فَقُلْتُ وَمَا هَذَا اللَّبَنُ فِي أَهْلِ الصُّفَّةِ كُنْتُ أَحَقُّ أَنَا أَنْ أُصِيبَ مِنْ هَذَا اللَّبَنِ شَرْبَةً أَتَقَوَّى بِهَا فَإِذَا جَاءَ أَمَرَنِي فَكُنْتُ أَنَا أُعْطِيهِمْ وَمَا عَسَى أَنْ يَبْلُغَنِي مِنْ هَذَا اللَّبَنِ وَلَمْ يَكُنْ مِنْ طَاعَةِ اللَّهِ وَطَاعَةِ رَسُولِهِ ﷺ بُدٌّ فَأَتَيْتُهُمْ فَدَعَوْتُهُمْ فَأَقْبَلُوا فَاسْتَأْذَنُوا فَأَذِنَ لَهُمْ وَأَخَذُوا مَجَالِسَهُمْ مِنْ الْبَيْتِ قَالَ يَا أَبَا هِرٍّ قُلْتُ لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ قَالَ خُذْ فَأَعْطِهِمْ قَالَ فَأَخَذْتُ الْقَدَحَ فَجَعَلْتُ أُعْطِيهِ الرَّجُلَ فَيَشْرَبُ حَتَّى يَرْوَى ثُمَّ يَرُدُّ عَلَيَّ الْقَدَحَ فَأُعْطِيهِ الرَّجُلَ فَيَشْرَبُ حَتَّى يَرْوَى ثُمَّ يَرُدُّ عَلَيَّ الْقَدَحَ فَيَشْرَبُ حَتَّى يَرْوَى ثُمَّ يَرُدُّ عَلَيَّ الْقَدَحَ حَتَّى انْتَهَيْتُ إِلَى النَّبِيِّ ﷺ وَقَدْ رَوِيَ الْقَوْمُ كُلُّهُمْ فَأَخَذَ الْقَدَحَ فَوَضَعَهُ عَلَى يَدِهِ فَنَظَرَ إِلَيَّ فَتَبَسَّمَ فَقَالَ أَبَا هِرٍّ قُلْتُ لَبَّيْكَ يَا رَسُولَ اللَّهِ قَالَ بَقِيتُ أَنَا وَأَنْتَ قُلْتُ صَدَقْتَ يَا رَسُولَ اللَّهِ قَالَ اقْعُدْ فَاشْرَبْ فَقَعَدْتُ فَشَرِبْتُ فَقَالَ اشْرَبْ فَشَرِبْتُ فَمَا زَالَ يَقُولُ اشْرَبْ حَتَّى قُلْتُ لاَ وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ مَا أَجِدُ لَهُ مَسْلَكًا قَالَ فَأَرِنِي فَأَعْطَيْتُهُ الْقَدَحَ فَحَمِدَ اللَّهَ وَسَمَّى وَشَرِبَ الْفَضْلَةَ. [رواه البخاري: ٦٤٥٣]

**2094.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Özündən başqa məbud olmayan Allaha and olsun ki, mən bəzən aclıqdan qarnımı yerə dayayardım, bəzən də aclığı hiss etməyim deyə qarnıma daş bağlayardım. Bir gün mən (müsəlmanların) gedib-gəldiyi yolun üstündə oturdum. Elə bu vaxt Əbu Bəkr gəlib yanımdan keçdi və mən ondan Allahın Kitabındakı bir ayə haqqında soruşdum. Ona sual verməkdə (məqsədim) ancaq bu idi ki, o, (aclıqdan əziyyət çəkdiyimi görüb) mənə yemək versin. Lakin o çıxıb getdi və mənə heç nə vermədi. Sonra Ömər gəlib keçdi və mən ondan da Allahın Kitabındakı bir ayə barəsində soruşdum və sual verməkdə (məqsədim) ancaq bu idi ki, o, mənə yemək versin. Amma o da (mənə heç bir şey vermədən) çıxıb getdi. Daha sonra Əbul Qasım ﷺ gəlib keçdi və məni gördükdə gülümsədi, ürəyimdən nələr keçdiyini üzümdən oxudu və dedi: "Ey Əbu Hirr!"[1] Dedim: "Əmrinə müntəzirəm, ya Rəsulullah!" O: "Gəl dalımca!"– deyib getdi, mən də qalxıb onun dalınca getdim. O gedib evə daxil oldu. Mən (içəri girmək) üçün izn istədim və mənə izn verildi. Peyğəmbər ﷺ evdə bir cam süd gördü və: "Bu süd hardandır?"- deyə soruşdu. (Ona): "Filankəs hədiyyə edib"– dedilər. Peyğəm-

[1] 1879-cu hədisin qeydlərinə bax.

bər ﷺ buyurdu: "Ey Əbu Hirr!" Dedim: "Əmrinə müntəzirəm, ya Rəsulullah!" Dedi: "Süffə əhlinin[1] yanına get və onları mənim yanıma çağır!"

(Əbu Hureyra) dedi: "Süffə əhli İslam dininin qonaqları idi və onların Mədinədə nə ailəsi, nə mal-dövləti, nə də yaxın bir adamı var idi. Peyğəmbərə ﷺ sədəqə gətirildikdə bunu onlara göndərər və ondan özünə heç bir şey götürməzdi. Ona hədiyyə verildikdə isə ondan bir qədər özünə götürər, qalanını isə onlara göndərər, onları da yeməyə şərik edərdi. Peyğəmbərin ﷺ onları evə dəvət etməsi məni pərişan etdi və mən (öz-özümə) dedim: "Süffə əhli üçün bu bir cam süd nədir ki? Həm də ki, bu süddən içib güc toplamağa mən daha çox layiqəm. Əgər onlar gəlsələr, Peyğəmbər ﷺ mənə südü əvvəlcə onlara verməyi əmr edəcək. Belə olduğu təqdirdə isə çətin ki, mənə bu süddən nəsə çatsın." Lakin Allaha və Onun rəsuluna itaət etməkdən başqa çarəm qalmadığından gedib onları çağırdım. Onlar gəlib içəri keçmək üçün izn istədilər və onlara izn verildi. Onlar içəri daxil olub yerbəyer olduqdan sonra Peyğəmbər ﷺ dedi: "Ey Əbu Hirr!" Dedim: "Əmrinə müntəzirəm, ya Rəsulullah!" Dedi: "Götür (bu südü), onlara ver!" Mən camı götürüb onlara birər-birər verməyə başladım. Onlardan hər biri camı götürüb doyunca süd içdikdən sonra onu mənə qaytarır, mən də onu alıb növbəti adama uzadırdım. Nəhayət, oradakıların hamısı (bu süddən) içib doyandan sonra mən camı Peyğəmbərə ﷺ uzatdım. Peyğəmbər ﷺ camı götürüb əlinin içinə qoydu, sonra mənə baxıb gülümsədi və dedi: "Ey Əbu Hirr!" Dedim: "Əmrinə müntəzirəm, ya Rəsulullah!" Dedi: "Mən, bir də sən qaldın!" Dedim: "Elədir, ya Rəsulullah!" Dedi: "Otur, iç!" Mən oturub (süddən) içdim. Bir daha: "İç!"– dedi və mən (yenə süddən) içdim. Peyğəmbər ﷺ bunu o vaxta qədər təkrar etdi ki, axırda mən dedim: "Yox, səni haqq ilə göndərən Allaha and olsun ki, içməyə yerim yoxdur." Dedi: "Elə isə onu mənə ver!" Mən camı ona verdim və o, Allaha həmd edib "bismillah" dedikdən sonra südün artıq qalanını içdi." (əl-Buxari, 6453)

٢٠٩٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ اللَّهُمَّ ارْزُقْ آلَ مُحَمَّدٍ قُوتًا. [رواه البخاري: ٦٤٦٠]

**2095.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahım, Muhəmmədin ailəsinə gündəlik yemək nəsib et!" (əl-Buxari, 6460)

## 10-cu fəsil. Əməlləri qətiyyətlə və davamlı olaraq yerinə yetirmək

## ١٠– باب: الْقَصْدُ وَالْمُدَاوَمَةُ عَلَى الْعَمَلِ

٢٠٩٦ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لَنْ يُنَجِّيَ أَحَدًا مِنْكُمْ عَمَلُهُ قَالُوا وَلاَ أَنْتَ يَا رَسُولَ اللَّهِ قَالَ وَلاَ أَنَا إِلاَّ أَنْ يَتَغَمَّدَنِي اللَّهُ بِرَحْمَةٍ سَدِّدُوا وَقَارِبُوا وَاغْدُوا وَرُوحُوا وَشَيْءٌ مِنَ الدُّلْجَةِ وَالْقَصْدَ الْقَصْدَ تَبْلُغُوا. [رواه البخاري: ٦٤٦٣]

**2096.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizlərdən heç kəsin əməli onu (əzabdan) xilas etməyəcək." (Əshabələr) soruşdular: "Səni də, ya

[1] 369-cu hədisin qeydlərinə bax.

Rəsulullah?" Dedi: "Hətta məni də. Yalnız Allahın mənə mərhəmət göstərməsi istisnadır. Elə isə doğru yol tutun, (ən kamil olanı yerinə yetirə bilməsəniz, heç olmasa, ona) yaxınlaşın, səhər və axşam, habelə gecənin bir vaxtı (yaxşı işlər görməyə) çalışın. Beləcə, yavaş-yavaş (muradınıza) çatacaqsınız." (əl-Buxari, 6463)

٢٠٩٧ – عَنْ عَائِشَةَ رضي الله عنها أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: سَدِّدُوا وَقَارِبُوا وَاعْلَمُوا أَنْ لَنْ يُدْخِلَ أَحَدَكُمْ عَمَلُهُ الْجَنَّةَ وَأَنَّ أَحَبَّ الأَعْمَالِ إِلَى اللَّهِ أَدْوَمُهَا وَإِنْ قَلَّ. [رواه البخاري: ٦٤٦٥]

**2097.** Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Doğru yol tutun, (ən kamil olanı yerinə yetirə bilməsəniz, heç olmasa, ona) yaxınlaşın və bilin ki, sizlərdən heç kəsin əməli onu Cənnətə daxil edə bilməz. Bilin ki, əməllərdən Allahın ən çox xoşuna gələni az da olsa, davamlı olanıdır." (əl-Buxari, 6465)

## 11-ci fəsil. Ümid və qorxu ilə (ibadət etmək)

## ١١– باب: الرَّجَاءُ مَعَ الْخَوْفِ

٢٠٩٨ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ إِنَّ اللَّهَ خَلَقَ الرَّحْمَةَ يَوْمَ خَلَقَهَا مِائَةَ رَحْمَةٍ فَأَمْسَكَ عِنْدَهُ تِسْعًا وَتِسْعِينَ رَحْمَةً وَأَرْسَلَ فِي خَلْقِهِ كُلِّهِمْ رَحْمَةً وَاحِدَةً فَلَوْ يَعْلَمُ الْكَافِرُ بِكُلِّ الَّذِي عِنْدَ اللَّهِ مِنَ الرَّحْمَةِ لَمْ يَيْئَسْ مِنَ الْجَنَّةِ وَلَوْ يَعْلَمُ الْمُؤْمِنُ بِكُلِّ الَّذِي عِنْدَ اللَّهِ مِنَ الْعَذَابِ لَمْ يَأْمَنْ مِنَ النَّارِ. [رواه البخاري: ٦٤٦٩]

**2098.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Allah rəhməti yaratdığı gün onu yüz rəhmət olaraq yaratmış və doxsan doqquzunu Özündə saxlamış, məxluqatının hamısına isə cəmi bir rəhmət göndərmişdir. Əgər kafir Allah yanında olan rəhmətin nə qədər olduğunu bilsəydi, Cənnətdən ümidini üzməzdi və əgər mömin Allah yanında olan əzabın nə dərəcədə olduğunu bilsəydi, Cəhənnəmdən (xilas olacağına) arxayın olmazdı." (əl-Buxari, 6469)

## 12-ci fəsil. Dili qorumaq və Peyğəmbərin ﷺ: "Kim Allaha və Axirət gününə inanırsa, ya xeyir danışsın, ya da sussun" sözü

## ١٢– باب: حِفْظُ اللِّسَانِ وَقَوْلُ النَّبِيِّ ﷺ مَنْ كَانَ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ فَلْيَقُلْ خَيْرًا أَوْ لِيَصْمُتْ

٢٠٩٩ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ رضي الله عنه عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: مَنْ يَضْمَنْ لِي مَا بَيْنَ لَحْيَيْهِ وَمَا بَيْنَ رِجْلَيْهِ أَضْمَنْ لَهُ الْجَنَّةَ. [رواه البخاري: ٦٤٧٤]

**2099.** Səhl ibn Səd ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim mənə iki çənəsi arasındakını və iki budu arasındakını qoruyacağına zəmanət verərsə[1], mən onun Cənnətə (girəcəyinə) zəmanət verərəm." (əl-Buxari, 6474)

[1] Burada dili və tənasül orqanını günaha batmaqdan qorumaq nəzərdə tutulur.

٢١٠٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: إِنَّ الْعَبْدَ لَيَتَكَلَّمُ بِالْكَلِمَةِ مِنْ رِضْوَانِ اللَّهِ لاَ يُلْقِي لَهَا بَالاً يَرْفَعُهُ اللَّهُ بِهَا دَرَجَاتٍ وَإِنَّ الْعَبْدَ لَيَتَكَلَّمُ بِالْكَلِمَةِ مِنْ سَخَطِ اللَّهِ لاَ يُلْقِي لَهَا بَالاً يَهْوِي بِهَا فِي جَهَنَّمَ. [رواه البخاري: ٦٤٧٨]

**2100.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həqiqətən, adam Allahı razı salan, özünün də fərqinə varmadığı elə bir söz danışa bilər ki, Allah onun sayəsində həmin adamı dərəcələrə yüksəldər. Həmçinin, adam Allahın qəzəbinə səbəb olan, özünün də fərqinə varmadığı elə bir söz danışa bilər ki, Allah buna görə həmin adamı Cəhənnəmə giriftar edər." (əl-Buxari, 6478)

## ١٣ – باب: الانْتِهَاءِ عَنِ الْمَعَاصِي

## 13-cü fəsil. Günahlara son qoymaq

٢١٠١ – عَنْ أَبِي مُوسَى ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ مَثَلِي وَمَثَلُ مَا بَعَثَنِي اللَّهُ كَمَثَلِ رَجُلٍ أَتَى قَوْمًا فَقَالَ رَأَيْتُ الْجَيْشَ بِعَيْنَيَّ وَإِنِّي أَنَا النَّذِيرُ الْعُرْيَانُ فَالنَّجَاءَ النَّجَاءَ فَأَطَاعَتْهُ طَائِفَةٌ فَأَدْلَجُوا عَلَى مَهْلِهِمْ فَنَجَوْا وَكَذَّبَتْهُ طَائِفَةٌ فَصَبَّحَهُمُ الْجَيْشُ فَاجْتَاحَهُمْ. [رواه البخاري: ٦٤٨٢]

**2101.** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim və Allahın mənimlə göndərdiyi (dinin) misalı, həmqəbilələrinin yanına gəlib (onlara): "Mən düşmən ordusunu öz gözlərimlə gördüm, mən çılpaq (olaraq qövmünü) xəbərdar edən birisiyəm, qaçın canınızı qurtarın"- deyən kimsənin misalına bənzəyir. Onlardan bir qismi onun sözünə baxıb axşam düşənədək yavaşca aradan çıxmış və (düşməndən) xilas olmuşlar, geridə qalanları isə onu yalançı hesab etmiş, düşmən də səhərə yaxın onlara hücum edib hamısını məhv etmişlər." (əl-Buxari, 6482)

## ١٤ – باب: حُجِبَتْ النَّارُ بِالشَّهَوَاتِ

## 14-cü fəsil. Cəhənnəm odu şəhvətlər arxasındadır

٢١٠٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: حُجِبَتْ النَّارُ بِالشَّهَوَاتِ وَحُجِبَتْ الْجَنَّةُ بِالْمَكَارِهِ. [رواه البخاري: ٦٤٨٧]

**2102.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cəhənnəm odu şəhvətlər arxasında, Cənnət isə xoşagəlməz şeylər arxasındadır." (əl-Buxari, 6487)

## ١٥ – باب: الْجَنَّةُ أَقْرَبُ إِلَى أَحَدِكُمْ مِنْ شِرَاكِ نَعْلِهِ وَالنَّارُ مِثْلُ ذَلِكَ

## 15-ci fəsil. Cənnət birinizə onun səndəlinin qaytanından daha yaxındır, Cəhənnəm də həmçinin

٢١٠٣ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ الْجَنَّةُ أَقْرَبُ إِلَى أَحَدِكُمْ مِنْ شِرَاكِ نَعْلِهِ وَالنَّارُ مِثْلُ ذَلِكَ. [رواه البخاري: ٦٤٨٨]

**2103.** Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnət birinizə onun səndəlinin qaytanından daha yaxındır, Cəhənnəm də həmçinin." (əl-Buxari, 6488)

## 16-cı fəsil. (Hər kəs) özündən yuxarı təbəqədə olan kimsəyə yox, aşağı təbəqədə olan kimsəyə baxmalıdır

## ١٦- باب: لِيَنْظُرْ إِلَى مَنْ هُوَ أَسْفَلَ مِنْهُ وَلاَ يَنْظُرْ إِلَى مَنْ هُوَ فَوْقَهُ

٢١٠٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ رَسُولِ اللَّهِ ﷺ قَالَ: إِذَا نَظَرَ أَحَدُكُمْ إِلَى مَنْ فُضِّلَ عَلَيْهِ فِي الْمَالِ وَالْخَلْقِ فَلْيَنْظُرْ إِلَى مَنْ هُوَ أَسْفَلَ مِنْهُ. [رواه البخاري: ٦٤٩٠]

**2104.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz özünə var-dövlət və (gözəl) bədən quruluşu bəxş edilmiş bir kimsəyə baxsa, qoy özündən aşağı təbəqədə olan kimsəyə də baxsın." (əl-Buxari, 6490)

## 17-ci fəsil. Bir yaxşılıq və ya bir pislik etməyə niyyət edən kimsə haqqında

## ١٧- باب: مَنْ هَمَّ بِحَسَنَةٍ أَوْ بِسَيِّئَةٍ

٢١٠٥ – عَنْ ابْنِ عَبَّاسٍ ﷺ عَنْ النَّبِيِّ ﷺ فِيمَا يَرْوِي عَنْ رَبِّهِ عَزَّ وَجَلَّ قَالَ: قَالَ إِنَّ اللَّهَ كَتَبَ الْحَسَنَاتِ وَالسَّيِّئَاتِ ثُمَّ بَيَّنَ ذَلِكَ فَمَنْ هَمَّ بِحَسَنَةٍ فَلَمْ يَعْمَلْهَا كَتَبَهَا اللَّهُ لَهُ عِنْدَهُ حَسَنَةً كَامِلَةً فَإِنْ هُوَ هَمَّ بِهَا فَعَمِلَهَا كَتَبَهَا اللَّهُ لَهُ عِنْدَهُ عَشْرَ حَسَنَاتٍ إِلَى سَبْعِ مِائَةِ ضِعْفٍ إِلَى أَضْعَافٍ كَثِيرَةٍ وَمَنْ هَمَّ بِسَيِّئَةٍ فَلَمْ يَعْمَلْهَا كَتَبَهَا اللَّهُ لَهُ عِنْدَهُ حَسَنَةً كَامِلَةً فَإِنْ هُوَ هَمَّ بِهَا فَعَمِلَهَا كَتَبَهَا اللَّهُ لَهُ سَيِّئَةً وَاحِدَةً. [رواه البخاري: ٦٤٩١]

**2105.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Rəbbindən belə rəvayət etmişdir: "Allah savab və günah işləri yazmış, sonra da bunları bəyan etmişdir. Kim bir savab iş görməyə niyyət etsə, sonra buna əməl etməzsə, Allah onun üçün Öz yanında tam bir savab yazar. Əgər o savab iş görməyə niyyət edər və bunu yerinə yetirərsə, Allah onun üçün Öz yanında ondan yeddi yüzədək, hətta bundan qat-qat artıq savab yazar. Kim bir günah iş görməyə niyyət etsə, sonra buna əməl etməzsə, Allah onun üçün Öz yanında tam bir savab yazar. Əgər o günah iş görməyə niyyət edər və bunu yerinə yetirərsə, Allah ona cəmi bir günah yazar. (əl-Buxari, 6491)

## 18-ci fəsil. Əmanətin yox olması

## ١٨- باب: رَفْعُ الأَمَانَةِ

٢١٠٦ – (أ)- عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: حَدَّثَنَا رَسُولُ اللَّهِ ﷺ حَدِيثَيْنِ رَأَيْتُ أَحَدَهُمَا وَأَنَا أَنْتَظِرُ الآخَرَ حَدَّثَنَا أَنَّ الأَمَانَةَ نَزَلَتْ فِي جَذْرِ قُلُوبِ الرِّجَالِ ثُمَّ عَلِمُوا مِنْ الْقُرْآنِ ثُمَّ عَلِمُوا مِنْ السُّنَّةِ وَحَدَّثَنَا عَنْ رَفْعِهَا قَالَ يَنَامُ الرَّجُلُ النَّوْمَةَ فَتُقْبَضُ الأَمَانَةُ مِنْ قَلْبِهِ فَيَظَلُّ أَثَرُهَا مِثْلَ أَثَرِ الْوَكْتِ ثُمَّ يَنَامُ النَّوْمَةَ فَتُقْبَضُ فَيَبْقَى أَثَرُهَا مِثْلَ الْمَجْلِ

كَجَمْرٍ دَحْرَجْتَهُ عَلَى رِجْلِكَ فَنَفِطَ فَتَرَاهُ مُنْتَبِرًا وَلَيْسَ فِيهِ شَيْءٌ فَيُصْبِحُ النَّاسُ يَتَبَايَعُونَ فَلاَ يَكَادُ أَحَدٌ يُؤَدِّي الأَمَانَةَ فَيُقَالُ إِنَّ فِي بَنِي فُلاَنٍ رَجُلاً أَمِينًا وَيُقَالُ لِلرَّجُلِ مَا أَعْقَلَهُ وَمَا أَظْرَفَهُ وَمَا أَجْلَدَهُ وَمَا فِي قَلْبِهِ مِثْقَالُ حَبَّةِ خَرْدَلٍ مِنْ إِيمَانٍ وَلَقَدْ أَتَى عَلَيَّ زَمَانٌ وَمَا أُبَالِي أَيَّكُمْ بَايَعْتُ لَئِنْ كَانَ مُسْلِمًا رَدَّهُ عَلَيَّ الإِسْلاَمُ وَإِنْ كَانَ نَصْرَانِيًّا رَدَّهُ عَلَيَّ سَاعِيهِ فَأَمَّا الْيَوْمَ فَمَا كُنْتُ أُبَايِعُ إِلاَّ فُلاَنًا وَفُلاَنًا. [رواه البخاري: ٦٤٩٧]

**2106.** (a)– Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: "Peyğəmbər ﷺ bizə iki hədis danışmışdı. Mən onlardan birini artıq görmüşəm, o birisini isə gözləyirəm. Peyğəmbər ﷺ bizə xəbər vermişdir ki, əmanət (əməlisaleh) insanların qəlbinin dərinliyinə endirilmiş, sonra onlar Quranı, bunun ardından da sünnəni öyrənmişlər. Bundan başqa Peyğəmbər ﷺ əmanətin yox olacağı barədə bizə bildirib demişdir: "Adam yatacaq və (yuxuda ikən) əmanət onun qəlbindən götürüləcək, (yerində isə) rəngsiz nöqtə boyda izi qalacaq. Sonra yenə yatacaq və (o yuxuda ikən əmanətin qalan hissəsi də onun qəlbindən) götürüləcək, (yerində isə) suluğa bənzər izi qalacaq. Elə bil ki, (əlindəki) közü ayağının üstünə salmısan və onun düşdüyü yer suluqlayıb. Sən onun qabardığını görürsən, halbuki onun içi bomboşdur. O zaman insanlar bir-biriləri ilə sazişlər bağlayacaq, amma heç kəs əmanəti qaytarmaq barəsində heç düşünməyəcək də. (İş o yerə gəlib çatacaq ki, camaat) deyəcək: "Filan qəbilə sakinləri arasında etibarlı bir adam vardır." Birisinin barəsində: "O necə dərrakəli, necə bacarıqlı, necə dayanıqlı adamdır!"– deyiləcək, halbuki onun qəlbində xardal dənəsi ağırlığında iman olmayacaqdır."

(Huzeyfə) dedi: "Mən elə bir zamanda yaşamışam ki, həmin vaxt kiminlə alış-veriş edəcəyim məni narahat etməzdi. Belə ki, (iş gördüyüm adam) müsəlman olardısa, (əmanəti) mənə İslam dini[1] qaytarardı, xristian olardısa, əmanəti mənə onun yaşadığı yerin rəhbəri qaytarardı. Bu gün isə mən ancaq filankəs və filankəslə iş görürəm." (əl-Buxari, 6497)

٢١٠٦ – (ب)– عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﵄ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: إِنَّمَا النَّاسُ كَالإِبِلِ الْمِائَةِ لاَ تَكَادُ تَجِدُ فِيهَا رَاحِلَةً. [رواه البخاري: ٦٤٩٨]

**2106.** (b)– Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "İnsanlar yüz dəvəyə bənzəyir ki, aralarında minmək üçün bir dəvə tapmaq çox çətindir." (əl-Buxari, 6498)

## 19-cu fəsil. Riyakarlıq və şan-şöhrət

## ١٩– باب: الرِّيَاءُ وَالسُّمْعَةُ

٢١٠٧ – عَنْ جُنْدَبَ ﵁ قَالَ: قَالَ النَّبِيُّ ﷺ مَنْ سَمَّعَ سَمَّعَ اللَّهُ بِهِ وَمَنْ يُرَائِي يُرَائِي اللَّهُ بِهِ. [رواه البخاري: ٦٤٩٩]

**2107.** Cundəb ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim (etdiyi əməli insanlara) eşitdirmək məqsədilə edərsə, Allah onu eşitdirər, kim də (etdiyi əməli insanlara) göstərmək məqsədilə edərsə, Allah onu (insanlara) göstərər." (əl-Buxari, 6499)

[1] Yəni şəriət qayda-qanunlarına əsasən əmanət yiyəsinə qaytarılardı.

## 20-ci fəsil. Təvazökarlıq

## ٢٠– باب: التَّوَاضُعُ

٢١٠٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ إِنَّ اللَّهَ قَالَ مَنْ عَادَى لِي وَلِيًّا فَقَدْ آذَنْتُهُ بِالْحَرْبِ وَمَا تَقَرَّبَ إِلَيَّ عَبْدِي بِشَيْءٍ أَحَبَّ إِلَيَّ مِمَّا افْتَرَضْتُ عَلَيْهِ وَمَا يَزَالُ عَبْدِي يَتَقَرَّبُ إِلَيَّ بِالنَّوَافِلِ حَتَّى أُحِبَّهُ فَإِذَا أَحْبَبْتُهُ كُنْتُ سَمْعَهُ الَّذِي يَسْمَعُ بِهِ وَبَصَرَهُ الَّذِي يُبْصِرُ بِهِ وَيَدَهُ الَّتِي يَبْطِشُ بِهَا وَرِجْلَهُ الَّتِي يَمْشِي بِهَا وَإِنْ سَأَلَنِي لأُعْطِيَنَّهُ وَلَئِنْ اسْتَعَاذَنِي لأُعِيذَنَّهُ وَمَا تَرَدَّدْتُ عَنْ شَيْءٍ أَنَا فَاعِلُهُ تَرَدُّدِي عَنْ نَفْسِ الْمُؤْمِنِ يَكْرَهُ الْمَوْتَ وَأَنَا أَكْرَهُ مَسَاءَتَهُ. [رواه البخاري: ٦٥٠٢]

**2108.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah buyurur: "Kim Mənim dostumla düşmənçilik edərsə, Mən ona hərb elan edərəm. Qulumun Mənə sevimli olan və onun vasitəsilə Mənə yaxınlaşdığı ən gözəl əməl ona vacib buyurduğum əməllərdir. Qulum nafilə ibadətləri yerinə yetirməklə Mənə o qədər yaxınlaşar ki, Mən onu sevərəm. Onu sevdiyim təqdirdə onun eşidən qulağı, görən gözü, tutan əli və yeriyən ayağı olaram. Məndən diləsə, ona dilədiyini verərəm, sığınacaq istəsə, ona sığınacaq verərəm. Mən görəcəyim bir işdə, ölmək istəməyən möminin canını aldıqda tərəddüd etdiyim kimi heç bir şeydə tərəddüd etmirəm. Çünki Mən ona yamanlıq etmək istəmirəm." (əl-Buxari, 6502)

## 21-ci fəsil. Kim Allahla qarşılaşmaq istəsə, Allah da onunla qarşılaşmaq istəyər

## ٢١– باب: مَنْ أَحَبَّ لِقَاءَ اللَّهِ أَحَبَّ اللَّهُ لِقَاءَهُ

٢١٠٩ – عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: مَنْ أَحَبَّ لِقَاءَ اللَّهِ أَحَبَّ اللَّهُ لِقَاءَهُ وَمَنْ كَرِهَ لِقَاءَ اللَّهِ كَرِهَ اللَّهُ لِقَاءَهُ قَالَتْ عَائِشَةُ أَوْ بَعْضُ أَزْوَاجِهِ إِنَّا لَنَكْرَهُ الْمَوْتَ قَالَ لَيْسَ ذَاكِ وَلَكِنَّ الْمُؤْمِنَ إِذَا حَضَرَهُ الْمَوْتُ بُشِّرَ بِرِضْوَانِ اللَّهِ وَكَرَامَتِهِ فَلَيْسَ شَيْءٌ أَحَبَّ إِلَيْهِ مِمَّا أَمَامَهُ فَأَحَبَّ لِقَاءَ اللَّهِ وَأَحَبَّ اللَّهُ لِقَاءَهُ وَإِنَّ الْكَافِرَ إِذَا حُضِرَ بُشِّرَ بِعَذَابِ اللَّهِ وَعُقُوبَتِهِ فَلَيْسَ شَيْءٌ أَكْرَهَ إِلَيْهِ مِمَّا أَمَامَهُ كَرِهَ لِقَاءَ اللَّهِ وَكَرِهَ اللَّهُ لِقَاءَهُ. [رواه البخاري: ٦٥٠٧]

**2109.** Ubadə ibn Samit ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Allahla qarşılaşmaq istəsə, Allah da onunla qarşılaşmaq istəyər, kim də Allahla qarşılaşmaq istəməsə, Allah da onunla qarşılaşmaq istəməz."

Aişə ﷺ (və ya zövcələrindən biri) demişdir: "Axı biz ölmək istəmirik?!" Peyğəmbər ﷺ buyurdu: "Söhbət bundan getmir. İş orasındadır ki, möminə ölüm yetişdiyi zaman ona müjdə verilir ki, Allah (ondan) razı qalmış və ona ehtiram göstərmişdir. Həmin an onun üçün qarşıda onu gözləyən (nemətdən) daha sevimli bir şey ola bilməz. Odur ki, o, Allahla qarşılaşmaq istəyir, Allah da onunla qarşılaşmaq istəyir. O ki qaldı kafirə, (ölüm) onu haqladığı zaman ona müjdə verilir ki, Allah onu əzaba düçar edəcək və onu cəzalandıracaqdır. Həmin an onun üçün qarşıda onu gözləyən (bəladan) daha pis bir şey ola bilməz. Odur ki, o, Allahla qarşılaşmaq istəmir, Allah da onunla qarşılaşmaq istəmir." (əl-Buxari, 6507)

## ٢٢– باب: سَكَرَاتُ الْمَوْتِ

## 22-ci fəsil. Ölüm bihuşluğu

٢١١٠ – عَنْ عَائِشَةَ ﵂ قَالَتْ: كَانَ رِجَالٌ مِنَ الأَعْرَابِ جُفَاةً يَأْتُونَ النَّبِيَّ ﷺ فَيَسْأَلُونَهُ مَتَى السَّاعَةُ فَكَانَ يَنْظُرُ إِلَى أَصْغَرِهِمْ فَيَقُولُ إِنْ يَعِشْ هَذَا لاَ يُدْرِكْهُ الْهَرَمُ حَتَّى تَقُومَ عَلَيْكُمْ سَاعَتُكُمْ.
قَالَ هِشَامٌ: يَعْنِي مَوْتَهُمْ. [رواه البخاري: ٦٥١١]

**2110.** Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "(Vaxtaşırı) kobud bədəvilərdən bir dəstə Peyğəmbərin ﷺ yanına gəlib: "Qiyamət nə zaman qopacaq?"– deyə soruşardı. O da onların ən kiçiyinə baxıb deyərdi: "Əgər buna (uzun ömür) yaşamaq qismət olarsa, o, qocalığın ixtiyar yaşına çatanadək sizin qiyamətiniz qopacaq."

Hişam dedi: "Peyğəmbər ﷺ bununla onların öləcəklərini qəsd edirdi." (əl-Buxari, 6511)

## ٢٣– باب: يَقْبِضُ اللَّهُ الأَرْضَ يَوْمَ الْقِيَامَةِ

## 23-cü fəsil. Qiyamət günü Allah yeri Ovucuna alacaqdır

٢١١١ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﵁ قَالَ النَّبِيُّ ﷺ تَكُونُ الأَرْضُ يَوْمَ الْقِيَامَةِ خُبْزَةً وَاحِدَةً يَتَكَفَّؤُهَا الْجَبَّارُ بِيَدِهِ كَمَا يَكْفَأُ أَحَدُكُمْ خُبْزَتَهُ فِي السَّفَرِ نُزُلاً لأَهْلِ الْجَنَّةِ فَأَتَى رَجُلٌ مِنَ الْيَهُودِ فَقَالَ بَارَكَ الرَّحْمَنُ عَلَيْكَ يَا أَبَا الْقَاسِمِ أَلاَ أُخْبِرُكَ بِنُزُلِ أَهْلِ الْجَنَّةِ يَوْمَ الْقِيَامَةِ قَالَ بَلَى قَالَ تَكُونُ الأَرْضُ خُبْزَةً وَاحِدَةً كَمَا قَالَ النَّبِيُّ ﷺ فَنَظَرَ النَّبِيُّ ﷺ إِلَيْنَا ثُمَّ ضَحِكَ حَتَّى بَدَتْ نَوَاجِذُهُ ثُمَّ قَالَ أَلاَ أُخْبِرُكَ بِإِدَامِهِمْ قَالَ إِدَامُهُمْ بَالاَمٌ وَنُونٌ قَالُوا وَمَا هَذَا قَالَ ثَوْرٌ وَنُونٌ يَأْكُلُ مِنْ زَائِدَةِ كَبِدِهِمَا سَبْعُونَ أَلْفًا. [رواه البخاري: ٦٥٢٠]

**2111.** Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü yer üzü (bütövlükdə) bir kökə kimi olacaq, biriniz səfərə çıxmaq istədiyi zaman əlinə kökə alıb (o yan-bu yana) çevirdiyi kimi Qüdrətli Allah onu Əlinə alıb çevirəcək və bu (kökə) Cənnət əhli üçün bir ziyafət olacaq." Sonra bir yəhudi Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Mərhəmətli Allah sənə xeyir-bərəkət versin, ey Əbul Qasım! Qiyamət günü Cənnət əhlinə veriləcək ziyafət barəsində sənə xəbər verimmi?" Peyğəmbər ﷺ: "Ver!"– dedi. (Yəhudi) Peyğəmbər ﷺ xəbər verdiyi kimi: "Yer bir kökə kimi olacaq"– dedi. (Bunu deyəndə) Peyğəmbər ﷺ bizə baxıb arxa dişləri görünənədək güldü. Sonra (yəhudi): "Sənə bu kökəni nə ilə yeyəcəkləri barədə xəbər verimmi?"– deyə soruşdu, (sonra sözünə davam edib) dedi: "Bu, bəlam və nun olacaq." (Əshabələr): "Bu nədir?"– deyə soruşdular. (Yəhudi) dedi: "Öküz və balıqdır. Bunların qara ciyərinin ən dadlı hissəsini yetmiş min nəfər yeyəcək." (əl-Buxari, 6520)

٢١١٢ – عَنْ سَهْلِ بْنِ سَعْدٍ ﵁ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ يُحْشَرُ النَّاسُ يَوْمَ الْقِيَامَةِ عَلَى أَرْضٍ بَيْضَاءَ عَفْرَاءَ كَقُرْصَةِ نَقِيٍّ.
قَالَ سَهْلٌ أَوْ غَيْرُهُ لَيْسَ فِيهَا مَعْلَمٌ لأَحَدٍ. [رواه البخاري: ٦٥٢١]

**2112.** Rəvayət edilir ki, Səhl ibn Səd ﷛ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qiyamət günü insanlar təmiz (undan bişirilmiş) kökəyə bənzər ağlı-qırmızılı bir yerə toplanılacaqlar."

Səhl və qeyrisi demişdir: "(Yəni) həmin yerdə heç bir əlamət olmayacaq." (əl-Buxari, 6521)

### 24-cü fəsil. Həşr olunmaq

### ٢٤ – باب: الحَشْرُ

٢١١٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷛ عَنْ النَّبِيِّ ﷺ قَالَ: يُحْشَرُ النَّاسُ عَلَى ثَلاَث طَرَائِقَ رَاغِبِينَ رَاهِبِينَ وَاثْنَان عَلَى بَعِير وَثَلاَثَةٌ عَلَى بَعِير وَأَرْبَعَةٌ عَلَى بَعِير وَعَشَرَةٌ عَلَى بَعِير وَيَحْشُرُ بَقِيَّتَهُمْ النَّارُ تَقِيلُ مَعَهُمْ حَيْثُ قَالُوا وَتَبِيتُ مَعَهُمْ حَيْثُ بَاتُوا وَتُصْبِحُ مَعَهُمْ حَيْثُ أَصْبَحُوا وَتُمْسِي مَعَهُمْ حَيْثُ أَمْسَوْا. [رواه البخاري: ٦٥٢٢]

**2113.** Əbu Hureyra ﷛ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət günü insanlar üç zümrəyə (bölünüb) məhşərə toplanılacaqlar: (birinci zümrə Allahın rəhmətinə) ümid bəsləyib (əzabından) qorxan kimsələr olacaq; (ikinci zümrə) iki-iki, üç-üç, dörd-dörd, on-on dəvələrə minib (həşr) olunacaqlar. Qalanlarını isə od məhşərə toplayacaq. Onlar dincəldikdə də, gecələdikdə də, səhərə çıxdıqda da, axşama çıxdıqda da od onların bərabərində olacaqdır." (əl-Buxari, 6522)

٢١١٤ – عَنْ عَائِشَةَ ﷞ قَالَتْ: قَالَ رَسُولُ اللَّهِ ﷺ تُحْشَرُونَ حُفَاةً عُرَاةً غُرْلاً قَالَتْ عَائِشَةُ فَقُلْتُ: يَا رَسُولَ اللَّهِ الرِّجَالُ وَالنِّسَاءُ يَنْظُرُ بَعْضُهُمْ إِلَى بَعْضٍ فَقَالَ الأَمْرُ أَشَدُّ مِنْ أَنْ يُهِمَّهُمْ ذَاكِ. [رواه البخاري: ٦٥٢٧]

**2114.** Rəvayət edilir ki, Aişə ﷞ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ dedi: "(Qiyamət günü) siz ayaqyalın, lüt-üryan və sünnət olunmamış halda məhşərə toplanacaqsınız." Mən soruşdum: "Ya Rəsulullah, kişilər və qadınlar bir-birilərinə baxacaqlarmı?" (Peyğəmbər ﷺ) dedi: "(Onların) işi elə çətin olacaq ki, bu onları heç maraqlandırmayacaq." (əl-Buxari, 6527)

### 25-ci fəsil. Uca Allahın: "Onlar dirildiləcəklərini fikirləşmirlərmi? *Həm də* əzəmətli bir gündə. O gündə ki, insanlar aləmlərin Rəbbinin qarşısında dayanacaqlar"[1] sözü

### ٢٥ – باب: قَوْلُ اللَّهِ تَعَالَى:
﴿أَلَا يَظُنُّ أُولَٰئِكَ أَنَّهُم مَّبْعُوثُونَ ۝٤ لِيَوْمٍ عَظِيمٍ ۝٥ يَوْمَ يَقُومُ النَّاسُ لِرَبِّ الْعَالَمِينَ ۝٦﴾

٢١١٥ – عَنْ أَبِي هُرَيْرَةَ ﷛ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: يَعْرَقُ النَّاسُ يَوْمَ الْقِيَامَةِ حَتَّى يَذْهَبَ عَرَقُهُمْ فِي الأَرْضِ سَبْعِينَ ذِرَاعًا وَيُلْجِمُهُمْ حَتَّى يَبْلُغَ آذَانَهُمْ. [رواه البخاري: ٦٥٣٢]

[1] "əl-Mutaffifin" surəsi, 4-6.

**2115.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qiyamət günü insanlar o qədər tərləyəcəklər ki, onların təri yerin yetmiş ərəş[1] dərinliyinə keçəcək, (üstəlik bəzilərinin) ağzına dirənəcək, hətta qulaqlarına çatacaqdır.” (əl-Buxari, 6532)

## ٢٦– باب: الْقِصَاصُ يَوْمَ الْقِيَامَةِ

## 26-cı fəsil. Qiyamət günü qisas almaq

٢١١٦ – عَنْ عَبْدَ اللَّهِ ﷺ قَالَ النَّبِيُّ ﷺ أَوَّلُ مَا يُقْضَى بَيْنَ النَّاسِ بِالدِّمَاءِ. [رواه البخاري: ٦٥٣٣]

**2116.** Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Qiyamət günü insanlar arasında veriləcək ilk hökm qan davalarına görə olacaq.” (əl-Buxari, 6533)

## ٢٧– باب: صِفَةُ الْجَنَّةِ وَالنَّارِ

## 27-ci fəsil. Cənnət və Cəhənnəmin vəsfi

٢١١٧ – عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ إِذَا صَارَ أَهْلُ الْجَنَّةِ إِلَى الْجَنَّةِ وَأَهْلُ النَّارِ إِلَى النَّارِ جِيءَ بِالْمَوْتِ حَتَّى يُجْعَلَ بَيْنَ الْجَنَّةِ وَالنَّارِ ثُمَّ يُذْبَحُ ثُمَّ يُنَادِي مُنَاد يَا أَهْلَ الْجَنَّةِ لاَ مَوْتَ وَيَا أَهْلَ النَّارِ لاَ مَوْتَ فَيَزْدَادُ أَهْلُ الْجَنَّةِ فَرَحًا إِلَى فَرَحِهِمْ وَيَزْدَادُ أَهْلُ النَّارِ حُزْنًا إِلَى حُزْنِهِمْ. [رواه البخاري: ٦٥٤٨]

**2117.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Cənnət əhli Cənnətə, Cəhənnəm əhli də Cəhənnəmə yerləşdikdən sonra ölüm (qoç şəklində) Cənnətlə Cəhənnəmin arasına gətirilib boğazlanacaq. Sonra carçı: “Ey Cənnət əhli, artıq ölüm yoxdur! Ey Cəhənnəm əhli, artıq ölüm yoxdur!”– deyəcək. (Bu xəbər) Cənnət əhlinin fərəhinin üstünə fərəh artırar, Cəhənnəm əhlinin isə qəminin üstünə qəm gətirər.” (əl-Buxari, 6548)

٢١١٨ – عَنْ أَبِي سَعِيد الْخُدْرِيِّ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ إِنَّ اللَّهَ تَبَارَكَ وَتَعَالَى يَقُولُ لأَهْلِ الْجَنَّة يَا أَهْلَ الْجَنَّة فَيَقُولُونَ لَبَّيْكَ رَبَّنَا وَسَعْدَيْكَ فَيَقُولُ هَلْ رَضِيتُمْ فَيَقُولُونَ وَمَا لَنَا لاَ نَرْضَى وَقَدْ أَعْطَيْتَنَا مَا لَمْ تُعْطِ أَحَدًا مِنْ خَلْقِكَ فَيَقُولُ أَنَا أُعْطِيكُمْ أَفْضَلَ مِنْ ذَلِكَ قَالُوا يَا رَبِّ وَأَيُّ شَيْءٍ أَفْضَلُ مِنْ ذَلِكَ فَيَقُولُ أُحِلُّ عَلَيْكُمْ رِضْوَانِي فَلاَ أَسْخَطُ عَلَيْكُمْ بَعْدَهُ أَبَدًا. [رواه البخاري: ٦٥٤٩]

**2118.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Ulu və uca Allah Cənnət əhlini çağırıb buyuracaq: “Ey Cənnət əhli!” Onlar: “Buyur, ey Rəbbimiz, əmrinə müntəzirik!”– deyə cavab verəcəklər. (Allah) soruşacaq: “Razı qaldınızmı?” Onlar deyəcəklər: “Bizə nə olub ki, razı qalmayaq?! Axı Sən bizə, yaratdıqlarından heç kəsə vermədiyin nemətləri bəxş etmisən!” Allah buyuracaq: “Mən sizə bundan da yaxşısını verəcəyəm!” Onlar deyəcəklər: “Ey Rəbbimiz! Bundan yaxşı nə ola bilər ki?” Allah buyuracaq: “Mən Öz rizamı sizə halal edirəm və bundan sonra Mənim sizə heç vaxt qəzəbim tutmayacaq.” (əl-Buxari, 6549)

---

[1] 311-ci hədisin qeydlərinə bax.

٢١١٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: مَا بَيْنَ مَنْكِبَيْ الْكَافِرِ مَسِيرَةُ ثَلاَثَةِ أَيَّامٍ لِلرَّاكِبِ الْمُسْرِعِ. [رواه البخاري: ٦٥٥١]

**2119.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Cəhənnəmə düşən hər bir) kafirin çiyinləri arasındakı məsafə atlının (öz atını) dörd nala çapıb üç günə qət etdiyi məsafəyə bərabər olacaqdır." (əl-Buxari, 6551)

٢١٢٠ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: يَخْرُجُ قَوْمٌ مِنَ النَّارِ بَعْدَ مَا مَسَّهُمْ مِنْهَا سَفْعٌ فَيَدْخُلُونَ الْجَنَّةَ فَيُسَمِّيهِمْ أَهْلُ الْجَنَّةِ الْجَهَنَّمِيِّينَ. [رواه البخاري: ٦٥٥٩]

**2120.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bəzi adamlar odda yanıb qaraldıqdan sonra oradan çıxıb Cənnətə girəcək. Cənnət əhli də belələrini: "Cəhənnəmliklər"– adlandıracaq." (əl-Buxari, 6559)

٢١٢١ – عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: إِنَّ أَهْوَنَ أَهْلِ النَّارِ عَذَابًا يَوْمَ الْقِيَامَةِ رَجُلٌ عَلَى أَخْمَصِ قَدَمَيْهِ جَمْرَتَانِ يَغْلِي مِنْهُمَا دِمَاغُهُ كَمَا يَغْلِي الْمِرْجَلُ وَالْقُمْقُمُ. [رواه البخاري: ٦٥٦٢]

**2121.** Rəvayət edilir ki, Nomən ibn Bəşir ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qiyamət günü ən yüngül əzaba məruz qalacaq od sakinləri o kimsələr olacaq ki, onların hər ayağının altına qızmar bir köz qoyulacaq və onun (istisindən) onların beyni, mis qazan və ya qumquma[1] qaynadığı kimi, qaynayacaqdır." (əl-Buxari, 6562)

٢١٢٢ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ لاَ يَدْخُلُ أَحَدٌ الْجَنَّةَ إِلاَّ أُرِيَ مَقْعَدَهُ مِنَ النَّارِ لَوْ أَسَاءَ لِيَزْدَادَ شُكْرًا وَلاَ يَدْخُلُ النَّارَ أَحَدٌ إِلاَّ أُرِيَ مَقْعَدَهُ مِنَ الْجَنَّةِ لَوْ أَحْسَنَ لِيَكُونَ عَلَيْهِ حَسْرَةً. [رواه البخاري: ٦٥٦٩]

**2122.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Cənnətə girən hər kəsə Cəhənnəmdəki yeri göstəriləcək (və ona bildiriləcək ki,) əgər günah işlər görmüş olsaydı (mütləq ora düşəcəkdi). Belə ediləcək ki, o adam daha da çox şükür etsin. Habelə, Cəhənnəmə düşən hər kəsə Cənnətdəki yeri göstəriləcək (və ona bildiriləcək ki,) əgər yaxşı işlər görmüş olsaydı (mütləq ora düşəcəkdi). Belə ediləcək ki, onun qəminin üstünə qəm gəlsin." (əl-Buxari, 6569)

## 28-ci fəsil. Hovuz haqqında (deyilənlər)

## ٢٨ – باب: فِي الْحَوْضِ

٢١٢٣ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عَمْرٍو ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ حَوْضِي مَسِيرَةُ شَهْرٍ مَاؤُهُ أَبْيَضُ مِنَ اللَّبَنِ وَرِيحُهُ أَطْيَبُ مِنَ الْمِسْكِ وَكِيزَانُهُ كَنُجُومِ السَّمَاءِ مَنْ شَرِبَ مِنْهَا فَلاَ يَظْمَأُ أَبَدًا. [رواه البخاري: ٦٥٧٩]

**2123.** Abdullah ibn Amr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim hovuzumun sahəsi bir ay gedilən yol qədər, suyunun rəngi süddən ağ, qoxusu müşkdən daha gözəl, ətrafına düzülmüş bardaqlar isə göydəki ulduzlar qədərdir. Ondan (bir dəfə) içən kimsə heç vaxt susamaz." (əl-Buxari, 6579)

[1] Yandan asılan kiçik su qabı.

٢١٢٤ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: أَمَامَكُمْ حَوْضٌ كَمَا بَيْنَ جَرْبَاءَ وَأَذْرُحَ. [رواه البخاري: ٦٥٧٧]

**2124.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qarşıda sizi elə bir hovuz gözləyir ki, (böyüklüyü) Cərba ilə Əzruh[1] arası boydadır." (əl-Buxari, 6577)

٢١٢٥ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: إِنَّ قَدْرَ حَوْضِي كَمَا بَيْنَ أَيْلَةَ وَصَنْعَاءَ مِنْ الْيَمَنِ وَإِنَّ فِيهِ مِنْ الأَبَارِيقِ كَعَدَدِ نُجُومِ السَّمَاءِ. [رواه البخاري: ٦٥٨٠]

**2125.** Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim hovuzumun böyüklüyü Əylə[2] ilə Yəmənin Səna şəhərinin arası boydadır, ətrafına düzülmüş qədəhlər isə göydəki ulduzlar qədərdir." (əl-Buxari, 6580)

٢١٢٦ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه عَنْ النَّبِيِّ ﷺ قَالَ: بَيْنَا أَنَا قَائِمٌ إِذَا زُمْرَةٌ حَتَّى إِذَا عَرَفْتُهُمْ خَرَجَ رَجُلٌ مِنْ بَيْنِي وَبَيْنِهِمْ فَقَالَ هَلُمَّ فَقُلْتُ أَيْنَ قَالَ إِلَى النَّارِ وَاللَّهِ قُلْتُ وَمَا شَأْنُهُمْ قَالَ إِنَّهُمْ ارْتَدُّوا بَعْدَكَ عَلَى أَدْبَارِهِمْ الْقَهْقَرَى ثُمَّ إِذَا زُمْرَةٌ حَتَّى إِذَا عَرَفْتُهُمْ خَرَجَ رَجُلٌ مِنْ بَيْنِي وَبَيْنِهِمْ فَقَالَ هَلُمَّ قُلْتُ أَيْنَ قَالَ إِلَى النَّارِ وَاللَّهِ قُلْتُ مَا شَأْنُهُمْ قَالَ إِنَّهُمْ ارْتَدُّوا بَعْدَكَ عَلَى أَدْبَارِهِمْ الْقَهْقَرَى فَلاَ أُرَاهُ يَخْلُصُ مِنْهُمْ إِلاَّ مِثْلُ هَمَلِ النَّعَمِ. [رواه البخاري: ٦٥٨٧]

**2126.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mən (yuxuda hovuzumun başında) dayanmış ikən bir zümrə gördüm. Mən onları tanıdıqda bir nəfər peyda olub mənimlə onların arasında durdu və onlara: "Gəlin gedək!"– deyə buyurdu. Dedim: "(Bunları) hara (aparırsan)?" Dedi: "Vallahi, Cəhənnəmə (aparıram)!" Dedim: "Bunların günahı nədir?" Dedi: "Onlar səndən sonra dinlərindən dönüb mürtəd olmuşlar." Sonra başqa bir zümrə gördüm Onları da tanıdıqda yenə bir nəfər peyda olub mənimlə onların arasında durdu və onlara: "Gəlin gedək!"– deyə əmr etdi. Dedim: "(Bunları) hara (aparırsan)?" Dedi: "Vallahi, Cəhənnəmə (aparıram)!" Dedim: "Bunların günahı nədir?" Dedi: "Onlar səndən sonra dinlərindən dönüb mürtəd olmuşlar." Mən bunlardan kimsənin (oddan) xilas olacağını güman etmirəm. Ancaq çobansız qalıb itmiş dəvə sürüsündən (yolunu tapmış dəvələr) kimi (tək-tük adamın əzabdan) qurtulması istisnadır." (əl-Buxari, 6587)

٢١٢٧ – عَنْ حَارِثَةَ بْنِ وَهْبٍ رضي الله عنه قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ وَذَكَرَ الْحَوْضَ فَقَالَ كَمَا بَيْنَ الْمَدِينَةِ وَصَنْعَاءَ. [رواه البخاري: ٦٥٩١]

**2127.** Rəvayət edilir ki, Harisə ibn Vəhb رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ öz hovuzu barədə belə dediyini eşitmişəm: "(Onun böyüklüyü) Mədinə ilə Səna arası boydadır." (əl-Buxari, 6591)

---

[1] Cərba və Əzruh Şamda yerləşən şəhərlərdir.
[2] Əylə Şam tərəfdən Qırmızı dənizin sahillərində yerləşən bir şəhərdir.

# ٨٢ – كِتَابُ الْقَدَرِ

# 82 – Qədər kitabı

## 1-ci fəsil. Allahın elminə (əsasən qəzavü-qədəri yazmış) qələm artıq qurumuşdur

## ١– باب: جَفَّ الْقَلَمُ عَلَى عِلْمِ اللَّهِ

٢١٢٨ – عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ﷺ قَالَ: قَالَ رَجُلٌ يَا رَسُولَ اللَّهِ أَيُعْرَفُ أَهْلُ الْجَنَّةِ مِنْ أَهْلِ النَّارِ قَالَ نَعَمْ قَالَ فَلِمَ يَعْمَلُ الْعَامِلُونَ قَالَ كُلٌّ يَعْمَلُ لِمَا خُلِقَ لَهُ أَوْ لِمَا يُسِّرَ لَهُ. [رواه البخاري: ٦٥٩٦]

**2128.** Rəvayət edilir ki, İmran ibn Husayn ﷺ demişdir: "(Bir dəfə) bir nəfər (Peyğəmbərə ﷺ) dedi: "Ya Rəsulullah, kimlərin Cənnət əhli, kimlərin də Cəhənnəm əhli olduğu bəllidirmi?" Peyğəmbər ﷺ: "Bəli!"– dedi. Adam soruşdu: "Elə isə insanların gördükləri işlər nəyə lazımdır?" Peyğəmbər ﷺ dedi: "Hər kəs nə üçün yaradılmışsa, (yaxud hər kəsə nə asanlaşdırılmışsa), ona uyğun da əməl edər." (əl-Buxari, 6596)

## 2-ci fəsil. Allahın əmri əzəldən müəyyən edilmiş bir hökmdür

## ٢– باب: وَكَانَ أَمْرُ اللَّهِ قَدَرًا مَقْدُورًا

٢١٢٩ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: لَقَدْ خَطَبَنَا النَّبِيُّ ﷺ خُطْبَةً مَا تَرَكَ فِيهَا شَيْئًا إِلَى قِيَامِ السَّاعَةِ إِلاَّ ذَكَرَهُ عَلِمَهُ مَنْ عَلِمَهُ وَجَهِلَهُ مَنْ جَهِلَهُ إِنْ كُنْتُ لأَرَى الشَّيْءَ قَدْ نَسِيتُ فَأَعْرِفُ مَا يَعْرِفُ الرَّجُلُ إِذَا غَابَ عَنْهُ فَرَآهُ فَعَرَفَهُ. [رواه البخاري: ٦٦٠٤]

**2129.** Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bizə xütbə verdi və xütbədə Qiyamət gününədək baş verəcək hər şeydən danışdı. Bəziləri (bunu) yadında saxladı, bəziləri isə unutdu. Necə ki, insan uzun müddət görmədiyini görən kimi tanıya bilir, mən də deyilənlərdən unutduğum bəzi şeyləri görüb xatırlayıram." (əl-Buxari, 6604)

## 3-cü fəsil. İnsanın nəzir verməklə qəzavü-qədərdən (qaçmağa cəhd göstərməsi)

## ٣– باب: إِلْقَاءُ الْعَبْدِ النَّذْرَ إِلَى الْقَدَرِ

٢١٣٠ – عَنِ ابْنِ عُمَرَ ﷺ قَالَ: نَهَى النَّبِيُّ ﷺ عَنِ النَّذْرِ وَقَالَ إِنَّهُ لاَ يَرُدُّ شَيْئًا وَإِنَّمَا يُسْتَخْرَجُ بِهِ مِنَ الْبَخِيلِ. [رواه البخاري: ٦٦٠٩]

**2130.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "Peyğəmbər ﷺ nəzir etməyi qadağan edib demişdir: "Nəzir (qədərdən) heç nəyi dəyişdirə bilməz. Bu sadəcə xəsis adamdan qoparılan bir şeydir." (əl-Buxari, 6609)

## 4-cü fəsil. (Ancaq) Allahın qoruduğu kimsə qoruna bilər

## ٤ – باب: الْمَعْصُومُ مَنْ عَصَمَ اللَّهُ

٢١٣١ – عَنْ أَبِي سَعِيد الْخُدْرِيِّ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَا اسْتُخْلِفَ خَلِيفَةٌ إِلاَّ لَهُ بِطَانَتَان بِطَانَةٌ تَأْمُرُهُ بِالْخَيْرِ وَتَحُضُّهُ عَلَيْهِ وَبِطَانَةٌ تَأْمُرُهُ بِالشَّرِّ وَتَحُضُّهُ عَلَيْهِ وَالْمَعْصُومُ مَنْ عَصَمَ اللَّهُ. [رواه البخاري: ٦٦١١]

**2131.** Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hər xəlifənin iki sirdaşı olur. Biri ona yaxşılıq etməyi məsləhət görər və onu bu işə təşviq edər, digəri isə ona pislik etməyi məsləhət görər və onu bu işə təşviq edər. (Ancaq) Allahın qoruduğu kimsə qoruna bilər.” (əl-Buxari, 6611)

## 5-ci fəsil. (Allah) insanla onun qəlbi arasındadır[1]

## ٥ – باب: يَحُولُ بَيْنَ الْمَرْءِ وَقَلْبِهِ

٢١٣٢ – عَنْ عَبْدِ اللَّهِ ﷺ قَالَ: كَثِيرًا مِمَّا كَانَ النَّبِيُّ ﷺ يَحْلِفُ لاَ وَمُقَلِّبِ الْقُلُوب. [رواه البخاري: ٦٦١٧]

**2132.** Abdullah (ibn Məsud) ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ and içəndə çox vaxt deyərdi: “Xeyir, qəlbləri Çevirənə and olsun![2]” (əl-Buxari, 6617)

---

[1] Onun istəyinə çatmasına mane ola bilir.

[2] Lə, və Muqəllibil qulub!

# ٨٣ – كِتَابُ الأَيْمَانِ وَ النُّذُورِ

# 83 – Andlar və nəzirlər kitabı

## ١ – باب: قَوْلُ اللَّهِ تَعَالَى:

﴿ لَا يُؤَاخِذُكُمُ اللَّهُ بِاللَّغْوِ فِي أَيْمَانِكُمْ وَلَكِن يُؤَاخِذُكُم بِمَا عَقَّدتُّمُ الْأَيْمَانَ ﴾

## 1-ci fəsil. Uca Allahın: "Allah sizi qəsdiniz olmadan içdiyiniz andlara görə cəzalandırmaz, lakin O, sizi qəsdlə içdiyiniz andlara görə cəzalandıracaqdır"[1] sözü

٢١٣٣ – عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ سَمُرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ يَا عَبْدَ الرَّحْمَنِ بْنَ سَمُرَةَ لاَ تَسْأَلْ الإِمَارَةَ فَإِنَّكَ إِنْ أُوتِيتَهَا عَنْ مَسْأَلَةٍ وُكِلْتَ إِلَيْهَا وَإِنْ أُوتِيتَهَا مِنْ غَيْرِ مَسْأَلَةٍ أُعِنْتَ عَلَيْهَا وَإِذَا حَلَفْتَ عَلَى يَمِينٍ فَرَأَيْتَ غَيْرَهَا خَيْرًا مِنْهَا فَكَفِّرْ عَنْ يَمِينِكَ وَأْتِ الَّذِي هُوَ خَيْرٌ. [رواه البخاري: ٦٦٢٢]

**2133.** Abdur-Rəhman ibn Səmura ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ (ona) belə demişdir: "Ey Abdur-Rəhman ibn Səmura, heç vaxt vəzifə istəmə! Çünki əgər sən öz istəyinlə vəzifəyə gəlsən, bunun öhdəçiliyi sənin boynuna düşəcək (və Allah sənə yardım etməyəcək), yox, əgər sən vəzifəyə can atmadan buna nail olsan, onda bu işdə (Allah) sənə kömək edər. Habelə, əgər sən and içdikdən sonra, başqa bir işin ondan daha xeyirli olduğunu görsən, daha xeyirli olanı yerinə yetir və andını pozduğuna görə kəffarə ver." (əl-Buxari, 6622)

٢١٣٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: نَحْنُ الآخِرُونَ السَّابِقُونَ يَوْمَ الْقِيَامَةِ، وَقَالَ رَسُولُ اللَّهِ ﷺ وَاللَّهِ لأَنْ يَلِجَّ أَحَدُكُمْ بِيَمِينِهِ فِي أَهْلِهِ آثَمُ لَهُ عِنْدَ اللَّهِ مِنْ أَنْ يُعْطِيَ كَفَّارَتَهُ الَّتِي افْتَرَضَ اللَّهُ عَلَيْهِ. [رواه البخاري: ٦٦٢٥]

**2134.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Biz sonuncular Qiyamət günü hamıdan əvvəl (Cənnətə) girəcəyik."

Peyğəmbər ﷺ həmçinin demişdir: "Vallahi, sizdən birinizin andını israrla yerinə yetirib ailəsini təhlükə ilə üz-üzə qoyması, onun üçün Allah yanında Onun buyurduğu kəffarəni verməkdən daha böyük günah sayılır." (əl-Buxari, 6625)

## ٢ – باب: كَيْفَ كَانَتْ يَمِينُ النَّبِيِّ ﷺ

## 2-ci fəsil. Peyğəmbər ﷺ necə and içərdi

٢١٣٥ – عَنْ عَبْدِ اللَّهِ بْنِ هِشَامٍ ﷺ قَالَ: كُنَّا مَعَ النَّبِيِّ ﷺ وَهُوَ آخِذٌ بِيَدِ عُمَرَ بْنِ الْخَطَّابِ فَقَالَ لَهُ عُمَرُ يَا رَسُولَ اللَّهِ لأَنْتَ أَحَبُّ إِلَيَّ مِنْ كُلِّ شَيْءٍ إِلاَّ مِنْ نَفْسِي فَقَالَ النَّبِيُّ ﷺ لاَ وَالَّذِي نَفْسِي بِيَدِهِ حَتَّى أَكُونَ أَحَبَّ إِلَيْكَ مِنْ نَفْسِكَ فَقَالَ لَهُ عُمَرُ فَإِنَّهُ الآنَ وَاللَّهِ لأَنْتَ أَحَبُّ إِلَيَّ مِنْ نَفْسِي فَقَالَ النَّبِيُّ ﷺ الآنَ يَا عُمَرُ. [رواه البخاري: ٦٦٣٢]

**2135.** Rəvayət edilir ki, Abdullah ibn Hişam ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbərlə ﷺ bərabər yol gedərkən o, Ömər ibn Xəttabın əlindən tutdu və Ömər ona dedi: "Ya Rəsulullah, özümdən başqa mən səni hamıdan çox sevirəm." Pey-

[1] "əl-Maidə" surəsi, 89.

ğəmbər ﷺ buyurdu: "Xeyr, canım Əlində olan Allaha and olsun ki, sən məni özündən də çox sevməlisən." Ömər ona dedi: "Vallahi ki, indi mən səni hamıdan, hətta özümdən də çox sevirəm." Peyğəmbər ﷺ buyurdu: "Bax indi (sən vacib buyurulanı yerinə yetirdin), ey Ömər!" (əl-Buxari, 6632)

٢١٣٦ – عَنْ أَبِي ذَرٍّ ﷺ قَالَ: انْتَهَيْتُ إِلَى النَّبِيِّ ﷺ وَهُوَ فِي ظِلِّ الْكَعْبَةِ يَقُولُ هُمُ الأَخْسَرُونَ وَرَبِّ الْكَعْبَةِ هُمُ الأَخْسَرُونَ وَرَبِّ الْكَعْبَةِ قُلْتُ مَا شَأْنِي أَيُرَى فِيَّ شَيْءٌ مَا شَأْنِي فَجَلَسْتُ إِلَيْهِ وَهُوَ يَقُولُ فَمَا اسْتَطَعْتُ أَنْ أَسْكُتَ وَتَغَشَّانِي مَا شَاءَ اللَّهُ فَقُلْتُ مَنْ هُمْ بِأَبِي أَنْتَ وَأُمِّي يَا رَسُولَ اللَّهِ قَالَ الأَكْثَرُونَ أَمْوَالاً إِلاَّ مَنْ قَالَ هَكَذَا وَهَكَذَا وَهَكَذَا. [رواه البخاري: ٦٦٣٨]

**2136.** Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: "(Bir dəfə) mən Peyğəmbərin ﷺ yanına gedib (gördüm ki,) o, Kəbənin kölgəsində oturub təkrar-təkrar deyir: "Kəbənin Rəbbinə and olsun ki, onlar ziyana uğrayacaqlar! Kəbənin Rəbbinə and olsun ki, onlar ziyana uğrayacaqlar!" Mən (öz-özümə) dedim: "Mən nə etmişəm? Olmaya məndə bir nöqsan görüb? Axı mən nə etmişəm?", sonra da onun yanında oturdum. O (dayanmadan bu sözləri) təkrar edirdi. Mən narahat olduğumdan özümü saxlaya bilməyib dedim: "Atam-anam sənə qurban, ya Rəsulullah, kimdir onlar?" Dedi: "Mal-dövləti çox olanlar! Yalnız belə, belə və belə edənlər[1] istisnadır." (əl-Buxari, 6638)

## 3-cü fəsil. Uca Allahın: "*Münafiqlər Allaha çox möhkəm and içdilər ki,..*"[2] sözü

## ٣– باب: قَوْلُ الله تَعَالَى: ﴿وَأَقْسَمُوا۟ بِٱللَّهِ جَهْدَ أَيْمَـٰنِهِمْ﴾

٢١٣٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: لاَ يَمُوتُ لأَحَدٍ مِنَ الْمُسْلِمِينَ ثَلاَثَةٌ مِنَ الْوَلَدِ تَمَسُّهُ النَّارُ إِلاَّ تَحِلَّةَ الْقَسَمِ. [رواه البخاري: ٦٦٥٦]

**2137.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üç övladı ölən müsəlmana – (Allahın) verdiyi söz[3] istisna olmaqla – ona Cəhənnəm odu toxunmaz." (əl-Buxari, 6656)

## 4-cü fəsil. Unudub andını pozan kimsə haqqında

## ٤– باب: إِذَا حَنِثَ نَاسِيًا فِي الأَيْمَانِ

٢١٣٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: إِنَّ اللَّهَ تَجَاوَزَ لأُمَّتِي عَمَّا وَسْوَسَتْ أَوْ حَدَّثَتْ بِهِ أَنْفُسَهَا مَا لَمْ تَعْمَلْ بِهِ أَوْ تَكَلَّمْ. [رواه البخاري: ٦٦٦٤]

---

[1] Yəni malını Allah yolunda xərcləyənlər.

[2] "ən-Nur" surəsi, 53.

[3] Burada Peyğəmbər ﷺ Cəhənnəm odunun üstündən keçməyi qəsd edir. Başqa bir rəvayətdə deyilir ki, (bir dəfə) Peyğəmbər ﷺ Həfsənin yanında ikən buyurdu: "İnşallah ağac altında beyət edənlərdən heç biri Cəhənnəm oduna girməyəcəkdir!" Həfsə: "Ola bilməz, ya Rəsulullah!"– deyə təəccüb etdikdə, Peyğəmbər ﷺ onu qınadı. Onda Həfsə ona bu ayəni oxudu: **"İçinizdən hər kəs oraya varid olacaqdır"** Peyğəmbər ﷺ (buna aydınlıq gətirmək üçün) dedi: "Uca Allah buyurur: **"Sonra Biz müttəqiləri *oddan* xilas edəcək, zalımları isə orada diz üstə çökmüş halda tərk edəcəyik"** (Səhih əl-Muslim). Hədisdə zikr olunan ayələr "Məryəm" surəsinin 71-72-ci ayələridir.

**2138.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (Peyğəmbər ﷺ demişdir): "Allah (vəd etmişdir ki,) ümmətim (müəyyən) bir əməl etməyincə və ya bir söz danışmayınca, onların qəlbinə gələn vəsvəsələrə və ya qəlbindən keçən fikirlərə görə onları cəzalandırmayacaqdır.." (əl-Buxari, 6664)

## ٥- باب: النَّذْرُ فِي الطَّاعَةِ

## 5-ci fəsil. İtaət etməyi nəzir etmək

٢١٣٩ – عَنْ عَائِشَةَ رضي الله عنها عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَنْ نَذَرَ أَنْ يُطِيعَ اللَّهَ فَلْيُطِعْهُ وَمَنْ نَذَرَ أَنْ يَعْصِيَهُ فَلاَ يَعْصِهِ. [رواه البخاري: ٦٦٩٦]

**2139.** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim Allaha itaət etməyi nəzir etmişsə, qoy Ona itaət etsin. Kim Ona asi olmağı nəzir etmişsə, Ona asi olmasın." (əl-Buxari, 6696)

## ٦- باب: مَنْ مَاتَ وَعَلَيْهِ نَذْرٌ

## 6-cı fəsil. Boynunda nəzir qaldığı halda ölən kimsə haqqında

٢١٤٠ – عَنْ سَعْد بْنِ عُبَادَةَ الأَنْصَارِيِّ رضي الله عنه أَنَّهُ اسْتَفْتَى النَّبِيَّ ﷺ فِي نَذْرٍ كَانَ عَلَى أُمِّهِ فَتُوُفِّيَتْ قَبْلَ أَنْ تَقْضِيَهُ فَأَفْتَاهُ أَنْ يَقْضِيَهُ عَنْهَا. [رواه البخاري: ٦٦٩٨]

**2140.** Rəvayət edilir ki, (bir dəfə) Səd ibn Ubadə əl-Ənsari ﷺ anasının boynunda nəzir olduğunu, lakin bunu yerinə yetirmədən dünyadan köçdüyünü Peyğəmbərə ﷺ bildirib fətva istəmiş, o da ona anasının əvəzinə bu nəziri yerinə yetirməyi buyurmuşdur." (əl-Buxari, 6698)

## ٧- باب: النَّذْرُ فِيمَا لاَ يَمْلِكُ وَفِي مَعْصِيَةٍ

## 7-ci fəsil. Yerinə yetirməyə imkanı olmayan bir şeyi və ya günah iş görməyi nəzir etmək

٢١٤١ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: بَيْنَا النَّبِيُّ ﷺ يَخْطُبُ إِذَا هُوَ بِرَجُلٍ قَائِم فَسَأَلَ عَنْهُ فَقَالُوا أَبُو إِسْرَائِيلَ نَذَرَ أَنْ يَقُومَ وَلاَ يَقْعُدَ وَلاَ يَسْتَظِلَّ وَلاَ يَتَكَلَّمَ وَيَصُومَ فَقَالَ النَّبِيُّ ﷺ مُرْهُ فَلْيَتَكَلَّمْ وَلْيَسْتَظِلَّ وَلْيَقْعُدْ وَلْيُتِمَّ صَوْمَهُ. [رواه البخاري: ٦٧٠٤]

**2141.** Rəvayət edilir ki, ibn Abbas رضي الله عنهما demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ xütbə verərkən (günün altında) ayaq üstə durmuş bir nəfəri gördü və onun (niyə belə etdiyini) soruşdu. (Əshabələr) dedilər: "Bu, Əbu İsraildir! O, ayaq üstə duracağına, oturmayacağına, kölgəyə çəkilməyəcəyinə, danışmayacağına və oruc tutacağına dair nəzir etmişdir." Peyğəmbər ﷺ buyurdu: "Ona de ki, danışsın, kölgəyə çəkilsin, otursun və orucunu açsın!" (əl-Buxari, 6704)

# ٨٤ – كِتَابُ كَفَّارَاتِ الأَيْمَانِ

# 84 – Andları (pozmağın) kəffarəsi kitabı

## ١ – باب: صَاعُ الْمَدِينَةِ وَمُدُّ النَّبِيِّ ﷺ وَبَرَكَتُهُ

## 1-ci fəsil. Mədinə saası[1], Peyğəmbərin ﷺ muddu və onun bərəkəti

٢١٤٢ – عَنْ السَّائِبِ بْنِ يَزِيدَ ﵁ قَالَ: كَانَ الصَّاعُ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ مُدًّا وَثُلُثًا بِمُدِّكُمْ الْيَوْمَ. [رواه البخاري: ٦٧١٢]

**2142.** Rəvayət edilir ki, Saib ibn Yezid ﵁ demişdir: "Peyğəmbərin ﷺ zamanında olan saa bu gün işlətdiyiniz bir mudd və onun üçdə birinə bərabər idi." (əl-Buxari, 6712)

٢١٤٣ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﵁ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: اللَّهُمَّ بَارِكْ لَهُمْ فِي مِكْيَالِهِمْ وَصَاعِهِمْ وَمُدِّهِمْ. [رواه البخاري: ٦٧١٤]

**2143.** Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allahım, onların ölçülərinə, saalarına və mudlarına bərəkət ver!" (əl-Buxari, 6714)

[1] Saa – ölçü vahididir və dörd mudda bərabərdir. Bir mudd isə insanın iki ovucuna bərabərdir. Bu da yeddi yüz qrama bərabərdir. (Səmərul Müstətab, 1/28)

# ٨٥ – كِتَابُ الفَرَائِضِ

# 85 – Fərzlər kitabı

## ١– باب: مِيرَاثُ الْوَلَدِ مِنْ أَبِيهِ وَأُمِّهِ

## 1-ci fəsil. Uşağa atasından və anasından qalmış miras

٢١٤٤ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ عَنْ النَّبِيِّ ﷺ قَالَ: أَلْحِقُوا الْفَرَائِضَ بِأَهْلِهَا فَمَا بَقِيَ فَهُوَ لأَوْلَى رَجُلٍ ذَكَرٍ. [رواه البخاري: ٦٧٣٢]

**2144.** İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Miras paylarını sahiblərinə verin[1]. Yerdə qalanı isə (ata tərəfdən) ən yaxın olan kişiyə verilir." (əl-Buxari, 6732)

## ٢– باب: مِيرَاثُ ابْنَةِ ابْنٍ مَعَ بِنْتٍ

## 2-ci fəsil. Oğlunun qızı ilə yanaşı öz qızına qalmış miras haqqında

٢١٤٥ – عَنْ أَبِي مُوسَى ﵁ أَنَّهُ سُئِلَ عَنْ بِنْتٍ وَابْنَةِ ابْنٍ وَأُخْتٍ فَقَالَ: لِلْبِنْتِ النِّصْفُ وَلِلأُخْتِ النِّصْفُ وَأْتِ ابْنَ مَسْعُودٍ فَسَيُتَابِعُنِي فَسُئِلَ ابْنُ مَسْعُودٍ وَأُخْبِرَ بِقَوْلِ أَبِي مُوسَى فَقَالَ لَقَدْ ضَلَلْتُ إِذًا وَمَا أَنَا مِنْ الْمُهْتَدِينَ أَقْضِي فِيهَا بِمَا قَضَى النَّبِيُّ ﷺ لِلابْنَةِ النِّصْفُ وَلابْنَةِ ابْنٍ السُّدُسُ تَكْمِلَةَ الثُّلُثَيْنِ وَمَا بَقِيَ فَلِلأُخْتِ فَأَتَيْنَا أَبَا مُوسَى فَأَخْبَرْنَاهُ بِقَوْلِ ابْنِ مَسْعُودٍ فَقَالَ لاَ تَسْأَلُونِي مَا دَامَ هَذَا الْحَبْرُ فِيكُمْ. [رواه البخاري: ٦٧٣٦]

**2145.** Rəvayət edilir ki, (bir dəfə) Əbu Musadan ﵁ qıza, oğlun qızına və bacıya mirasdan nə qədər pay düşdüyünü soruşdular. Dedi: "Mirasın yarısı (ölənin) qızına, o biri yarısı isə bacısına çatır. Get, ibn Məsuddan (bu haqda) soruş, (düşünürəm ki, o da) mənim kimi cavab verəcək." Sonra (bu haqda) ibn Məsuddan soruşdular və Əbu Musanın dediklərini ona xəbər verdilər. İbn Məsud dedi: "(Belə fətva versəm,) mən (haqq yoldan) azar və doğru yola yönəlmişlərdən olmaram. Bu məsələdə mən sizə ancaq Peyğəmbərin ﷺ hökm verdiyi kimi hökm verəcəyəm: "(Mirasın) yarısı qıza, altıda biri də oğulun qızına çatır ki, bu da (mirasın) üçdə ikisinə bərabərdir. Yerdə qalanı isə bacıya çatır." Bundan sonra biz Əbu Musanın yanına gəlib ibn Məsudun ﵁ dediyini ona xəbər verdik. Onda Əbu Musa dedi: "Nə qədər ki, sizin aranızda belə böyük alim var, mənə sual verməyin." (əl-Buxari, 6736)

## ٣– باب: مَوْلَى الْقَوْمِ مِنْ أَنْفُسِهِمْ وَابْنُ الأُخْتِ مِنْهُمْ

## 3-cü fəsil. Bir qövmün azad etdiyi kölə, habelə bacıoğlu onlardandır

٢١٤٦ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﵁ عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَوْلَى الْقَوْمِ مِنْ أَنْفُسِهِمْ. [رواه البخاري: ٦٧٦١]

---

[1] Bax: "ən-Nisa" surəsi, 11, 12 və 176.

**2146.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Azad edilmiş kölə onu azad etmiş qəbiləyə aid edilir.” (əl-Buxari, 6761)

**٢١٤٧** – عَنْ أَنَسٍ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: ابْنُ أُخْتِ الْقَوْمِ مِنْهُمْ أَوْ مِنْ أَنْفُسِهِمْ. [رواه البخاري: ٦٧٦٢]

**2147.** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Eyni tayfaya mənsub olan kimsələrin bacısı oğlu onlardandır və ya onlara aid edilir.” (əl-Buxari, 6762)

## 4-cü fəsil. Atasından qeyrisinin oğlu olduğunu iddia edən kimsə haqqında

## ٤ – باب: مَنْ ادَّعَى إِلَى غَيْرِ أَبِيهِ

**٢١٤٨** – عَنْ سَعْد ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: مَنْ ادَّعَى إِلَى غَيْرِ أَبِيهِ وَهُوَ يَعْلَمُ أَنَّهُ غَيْرُ أَبِيهِ فَالْجَنَّةُ عَلَيْهِ حَرَامٌ. فَذَكَرْتُهُ لِأَبِي بَكْرَةَ فَقَالَ: وَأَنَا سَمِعَتْهُ أُذُنَايَ وَوَعَاهُ قَلْبِي مِنْ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٦٧٦٧]

**2148.** Rəvayət edilir ki, Səd ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Hər kim atasının kim olduğunu bilə-bilə qeyrisinin oğlu olduğunu iddia edərsə, Cənnət ona haram edilər.”

(Hədisi danışan ravi demişdir): “Mən bu hədisi Əbu Bəkrəyə danışdım və o (mənə belə) dedi: “Bu hədisi mən Peyğəmbərdən ﷺ öz qulaqlarımla eşitmişəm və onu qəlbimə həkk etmişəm.” (əl-Buxari, 6767)

**٢١٤٩** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: لاَ تَرْغَبُوا عَنْ آبَائِكُمْ فَمَنْ رَغِبَ عَنْ أَبِيهِ فَهُوَ كُفْرٌ. [رواه البخاري: ٦٧٦٨]

**2149.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Atalarınızdan imtina etməyin! Kim atasından imtina etsə, nankor olar.” (əl-Buxari, 6768)

# ٨٦ – كِتَابُ الْحُدُودِ

# 86 – Şəri cəzalar kitabı

## ١ – باب: الضَّرْبُ بِالْجَرِيدِ وَالنِّعَالِ

## 1-ci fəsil. (Günahkarı) xurma çubuğu və səndəllə vurmaq

٢١٥٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: أُتِيَ النَّبِيُّ ﷺ بِرَجُلٍ قَدْ شَرِبَ قَالَ: اضْرِبُوهُ، فَمِنَّا الضَّارِبُ بِيَدِهِ وَالضَّارِبُ بِنَعْلِهِ وَالضَّارِبُ بِثَوْبِهِ فَلَمَّا انْصَرَفَ قَالَ بَعْضُ الْقَوْمِ: أَخْزَاكَ اللَّهُ قَالَ: لاَ تَقُولُوا هَكَذَا لاَ تُعِينُوا عَلَيْهِ الشَّيْطَانَ. [رواه البخاري: ٦٧٧٧]

**2150.** Əbu Hureyra ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbərin ﷺ yanına şərab içmiş bir adam gətirdilər və Peyğəmbər ﷺ: "Vurun onu!"– deyə buyurdu. Aramızdan kimisi əli ilə, kimisi səndəli ilə, kimisi də paltarı ilə (onu) vurmağa başladı. Adam çıxıb getdikdə bəziləri ona: "Allah səni rüsvay eləsin!"– dedilər. Onda Peyğəmbər ﷺ dedi: "Belə deməyin və bu adamın əleyhinə şeytana yardım etməyin!" (əl-Buxari, 6777)

٢١٥١ – عَنْ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ ﷺ قَالَ: مَا كُنْتُ لأُقِيمَ حَدًّا عَلَى أَحَدٍ فَيَمُوتَ فَأَجِدَ فِي نَفْسِي إِلاَّ صَاحِبَ الْخَمْرِ فَإِنَّهُ لَوْ مَاتَ وَدَيْتُهُ وَذَلِكَ أَنَّ رَسُولَ اللَّهِ ﷺ لَمْ يَسُنَّهُ. [رواه البخاري: ٦٧٧٨]

**2151.** Rəvayət edilir ki, Əli ibn Əbu Talib ﷺ demişdir: "Mən cəzalandırdığım adamlardan kimsənin (verilən cəzaya tab gətirməyib) ölməsinə üzülməzdim. Yalnız şərab içən kimsədən başqa. Beləsi öldüyü təqdirdə mən onun ailəsinə qanbahası verərdim. Bu ona görə idi ki, Peyğəmbər ﷺ (şərab içən kimsəyə vurulan qamçıların sayına) hədd qoymamışdı." (əl-Buxari, 6778)

٢١٥٢ – عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ ﷺ أَنَّ رَجُلاً عَلَى عَهْدِ النَّبِيِّ ﷺ كَانَ اسْمُهُ عَبْدَ اللَّهِ وَكَانَ يُلَقَّبُ حِمَارًا وَكَانَ يُضْحِكُ رَسُولَ اللَّهِ ﷺ وَكَانَ النَّبِيُّ ﷺ قَدْ جَلَدَهُ فِي الشَّرَابِ فَأُتِيَ بِهِ يَوْمًا فَأَمَرَ بِهِ فَجُلِدَ فَقَالَ رَجُلٌ مِنَ الْقَوْمِ اللَّهُمَّ الْعَنْهُ مَا أَكْثَرَ مَا يُؤْتَى بِهِ فَقَالَ النَّبِيُّ ﷺ لاَ تَلْعَنُوهُ فَوَاللَّهِ مَا عَلِمْتُ إِنَّهُ يُحِبُّ اللَّهَ وَرَسُولَهُ. [رواه البخاري: ٦٧٨٠]

**2152.** Rəvayət edilir ki, Ömər ibn Xəttab ﷺ demişdir: "Peyğəmbərin ﷺ dövründə Uzunqulaq ləqəbi ilə tanınmış Abdullah adlı birisi var idi. Bu adam (arabir) Peyğəmbəri ﷺ güldürərdi. Peyğəmbər ﷺ ona şərab içdiyinə görə şallaq vurmağı əmr etmişdi. (Yenə) bir gün onu (şərab içdiyinə görə) Peyğəmbərin ﷺ yanına gətirdilər və Peyğəmbərin ﷺ əmri ilə ona şallaq vurdular. Bu vaxt camaatın arasından bir nəfər: "Allahım, ona lənət et! Onu nə tez-tez bura gətirirlər!"– dedi. (Bunu eşidəndə) Peyğəmbər ﷺ buyurdu: "Ona lənət oxumayın! Vallahi, mən yəqin bilirəm ki, o, Allahı və Onun rəsulunu sevir." (əl-Buxari, 6780)

## 2-ci fəsil. Oğrunun lənətlənməsi

## ٢– باب: لَعْنُ السَّارِقِ

٢١٥٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: لَعَنَ اللَّهُ السَّارِقَ يَسْرِقُ الْبَيْضَةَ فَتُقْطَعُ يَدُهُ وَيَسْرِقُ الْحَبْلَ فَتُقْطَعُ يَدُهُ. [رواه البخاري: ٦٧٨٣]

**2153.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yumurta oğurladığına görə əli kəsilən, həmçinin ip oğurladığına görə əli kəsilən oğruya Allahın lənəti olsun!" (əl-Buxari, 6783)

## 3-cü fəsil. Nə miqdarda (malın oğurlanmasına görə) əl kəsilir?

## ٣– باب: قَطْعُ اليَدِ وَ فِي كَم

٢١٥٤ – عَنْ عَائِشَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ تُقْطَعُ الْيَدُ فِي رُبُعِ دِينَارٍ فَصَاعِدًا. [رواه البخاري: ٦٧٨٩]

**2154.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Oğrunun) əli ancaq o halda kəsilir ki, (oğurlanmış malın dəyəri) dinarın dörddə birinə və bundan artığına bərabər olsun." (əl-Buxari, 6789)

٢١٥٥ – عَنْ عَائِشَةَ ﷺ أَنَّ يَدَ السَّارِقِ لَمْ تُقْطَعْ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ إِلاَّ فِي ثَمَنِ مِجَنٍّ حَجَفَةٍ أَوْ تُرْسٍ. [رواه البخاري: ٦٧٩٢]

**2155.** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ dövründə oğrunun əli ancaq o halda kəsilərdi ki, (oğurladığı şeyin qiyməti) qalxanın qiymətinə bərabər olsun." (əl-Buxari, 6792)

٢١٥٦ – عَنْ ابْنِ عُمَرَ ﷺ قَالَ: قَطَعَ النَّبِيُّ ﷺ فِي مِجَنٍّ ثَمَنُهُ ثَلاَثَةُ دَرَاهِمَ. [رواه البخاري: ٦٧٩٦]

**2156.** Rəvayət edilir ki, ibn Ömər ﷺ demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ üç dirhəm dəyərində bir qalxan oğurlamış oğrunun əlini kəsdirdi." (əl-Buxari, 6796)

# ٨٧ – كِتَابُ الْمُحَارِبِينَ مِنْ أَهْلِ الْكُفْرِ وَ الرِّدَّةِ

# 87 – (İslama qarşı) vuruşan kafirlər və mürtədlər[1] kitabı

## ١ – باب: كَمْ التَّعْزِيرُ وَالأَدَبُ

## 1-ci fəsil. (Adamı) tənbeh etmək və tərbiyələndirmək məqsədilə nə qədər (cəzalandırmaq olar)?

٢١٥٧ – عَنْ أَبِي بُرْدَةَ الأَنْصَارِيِّ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ لاَ تَجْلِدُوا فَوْقَ عَشْرَةِ أَسْوَاطٍ إِلاَّ فِي حَدٍّ مِنْ حُدُودِ اللَّهِ. [رواه البخاري: ٦٨٤٨]

**2157.** Rəvayət edilir ki, Əbu Burdə əl-Ənsari ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Allahın qoyduğu qadağaları pozan kimsəyə on qamçıdan artıq qamçı vurmayın. Yalnız (sayı təyin edilmiş) qadağa[2] istisnadır." (əl-Buxari, 6848)

## ٢– باب: قَذْفُ الْعَبِيدِ

## 2-ci fəsil. Köləni ittiham etmək

٢١٥٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ أَبَا الْقَاسِمِ ﷺ يَقُولُ: مَنْ قَذَفَ مَمْلُوكَهُ وَهُوَ بَرِيءٌ مِمَّا قَالَ جُلِدَ يَوْمَ الْقِيَامَةِ إِلاَّ أَنْ يَكُونَ كَمَا قَالَ. [رواه البخاري: ٦٨٥٨]

**2158.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Əbul Qasımın ﷺ belə dediyini eşitmişəm: "Kim zinadan uzaq olan bir köləsini (zinada) ittiham edərsə, Qiyamət günü onun özünə şallaq vurular. Yalnız sözündə həqiqət olan kimsələrdən başqa." (əl-Buxari, 6858)

---

[1] Dinindən dönmüş müsəlman.

[2] Sayı təyin edilmiş qadağaya bu ayəni misal çəkmək olar: **"Zinakar qadının və zinakar kişinin hər birinə yüz çubuq vurun..."** "ən-Nur" surəsi, 2; Həmçinin 1023-cü və 1188-ci hədislərə də bax.

# ٨٨ – كِتَابُ الدِّيَاتِ

# 88 – Qanbahası kitabı

## ١– باب: قَوْلُ اللهِ تَعَالَى: ﴿وَمَن يَقْتُلْ مُؤْمِنًا مُّتَعَمِّدًا فَجَزَآؤُهُۥ جَهَنَّمُ﴾

## 1-ci fəsil. Uca Allahın: "Hər kəs qəsdən bir mömini öldürərsə, onun cəzası içərisində əbədi qalacağı Cəhənnəm *olar*"[1] sözü

٢١٥٩ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لَنْ يَزَالَ الْمُؤْمِنُ فِي فُسْحَةٍ مِنْ دِينِهِ مَا لَمْ يُصِبْ دَمًا حَرَامًا. [رواه البخاري: ٦٨٦٢]

**2159.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mömin adam haram buyurulmuş (cana qəsd edib) qan tökməyənədək öz dinində firavanlıq içində olar[2]". (əl-Buxari, 6862)

٢١٦٠ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما قَالَ: قَالَ النَّبِيُّ ﷺ لِلْمِقْدَادِ إِذَا كَانَ رَجُلٌ مُؤْمِنٌ يُخْفِي إِيمَانَهُ مَعَ قَوْمٍ كُفَّارٍ فَأَظْهَرَ إِيمَانَهُ فَقَتَلْتَهُ فَكَذَلِكَ كُنْتَ أَنْتَ تُخْفِي إِيمَانَكَ بِمَكَّةَ مِنْ قَبْلُ. [رواه البخاري: ٦٨٦٦]

**2160.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ Miqdada dedi: "Mömin adam kafirlər arasında yaşadığı zaman imanını gizlədib (fürsət tapan kimi imanını) aşkara çıxararsa, sən də (buna rəğmən) onu öldürsən, (günah qazanarsan). Sən özün də əvvəllər Məkkədə yaşayarkən imanını beləcə gizlədirdin." (əl-Buxari, 6866)

## ٢– باب: قَوْلُ اللهِ تَعَالَى: ﴿وَمَنْ أَحْيَاهَا فَكَأَنَّمَآ أَحْيَا ٱلنَّاسَ جَمِيعًا﴾

## 2-ci fəsil. Uca Allahın: "Kim də onu ölümdən xilas edərsə, sanki bütün insanları xilas etmiş hesab olunar"[3] sözü

٢١٦١ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ مَنْ حَمَلَ عَلَيْنَا السِّلَاحَ فَلَيْسَ مِنَّا. [رواه البخاري: ٦٨٧٤]

**2161.** Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bizə qarşı silah qaldıran adam bizdən deyildir." (əl-Buxari, 6874)

---

[1] "ən-Nisa" surəsi, 93.
[2] Heç vaxt sıxıntıya düşməz.
[3] "əl-Maidə" surəsi, 32.

### 3-cü fəsil. Uca Allahın: “...cana can, gözə göz, buruna burun, qulağa qulaq, dişə diş, *vurulmuş* yaralara da *yaralarla* qisas alınmalıdır”[1] sözü

### ٣– باب: قَوْلُ اللهِ تَعَالَى:
﴿أَنَّ ٱلنَّفْسَ بِٱلنَّفْسِ وَٱلْعَيْنَ بِٱلْعَيْنِ وَٱلْأَنفَ بِٱلْأَنفِ وَٱلْأُذُنَ بِٱلْأُذُنِ وَٱلسِّنَّ بِٱلسِّنِّ وَٱلْجُرُوحَ قِصَاصٌ﴾

٢١٦٢ – عَنْ عَبْدِ اللَّهِ ﵁ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ لاَ يَحِلُّ دَمُ امْرِئٍ مُسْلِمٍ يَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنِّي رَسُولُ اللَّهِ إِلاَّ بِإِحْدَى ثَلاَثٍ النَّفْسُ بِالنَّفْسِ وَالثَّيِّبُ الزَّانِي وَالْمَارِقُ مِنْ الدِّينِ التَّارِكُ لِلْجَمَاعَةِ. [رواه البخاري: ٦٨٧٨]

**2162.** Abdullah (ibn Məsud) ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allahdan başqa (ibadətə layiq) məbud olmadığına və mənim Allahın elçisi olmağıma şəhadət gətirən müsəlmanın qanını (axıtmaq) halal deyildir. Yalnız üç hal istisnadır: cana can (qisas alınmalı), zinakar evli (kişi və ya qadın daşqalaq edilməli) və dinindən dönüb camaatdan uzaqlaşan (mürtəd edam olunmalıdır).” (əl-Buxari, 6878)

### 4-cü fəsil. Haqsız olaraq başqasının canına qəsd etmək istəyən kimsə haqqında

### ٤– باب: مَنْ طَلَبَ دَمَ امْرِئٍ بِغَيْرِ حَقٍّ

٢١٦٣ – عَنْ ابْنِ عَبَّاسٍ ﵄ أَنَّ النَّبِيَّ ﷺ قَالَ: أَبْغَضُ النَّاسِ إِلَى اللَّهِ ثَلاَثَةٌ مُلْحِدٌ فِي الْحَرَمِ وَمُبْتَغٍ فِي الإِسْلاَمِ سُنَّةَ الْجَاهِلِيَّةِ وَمُطَّلِبُ دَمِ امْرِئٍ بِغَيْرِ حَقٍّ لِيُهَرِيقَ دَمَهُ. [رواه البخاري: ٦٨٨٢]

**2163.** İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allahın ən nifrət etdiyi (insanlar) üçdür: haram sayılan bölgədə[2] dindən dönən kəs, müsəlman olduğu halda cahiliyyə adət-ənənələrinə can atan kimsə və haqsız yerə birisinin canına qəsd edib onun qanını axıdan kimsə.” (əl-Buxari, 6882)

### 5-ci fəsil. Rəhbərlikdən xəbərsiz olaraq öz haqqını götürən və ya qisas alan kimsə haqqında

### ٥– باب: مَنْ أَخَذَ حَقَّهُ أَوْ اقْتَصَّ دُونَ السُّلْطَانِ

٢١٦٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﵁ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: لَوْ اطَّلَعَ فِي بَيْتِكَ أَحَدٌ وَلَمْ تَأْذَنْ لَهُ خَذَفْتَهُ بِحَصَاةٍ فَفَقَأْتَ عَيْنَهُ مَا كَانَ عَلَيْكَ مِنْ جُنَاحٍ. [رواه البخاري: ٦٨٨٨]

**2164.** Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “Əgər bir adam sənin iznin olmadan sənin evinə boylansa, sən də daş atıb onun gözünü çıxartsan, (buna görə) sənə günah yazılmaz”. (əl-Buxari, 6888)

---

[1] “əl-Maidə” surəsi, 45.
[2] Məkkə və Mədinə şəhərlərindəki toxunulmaz ərazi.

## 6-cı fəsil. (Xəsarət yetirilmiş) barmaqların qanbahası

## ٦– باب: دِيَةُ الأَصَابِعِ

٢١٦٥ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: هَذِهِ وَهَذِهِ سَوَاءٌ يَعْنِي الْخِنْصَرَ وَالإِبْهَامَ. [رواه البخاري: ٦٨٩٥]

**2165.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Bu və bu eyni (hüquqa malikdir).” Bunu deyəndə o, çeçələ və baş barmağı qəsd edirdi. (əl-Buxari, 6895)

# ٨٩ – كِتَابُ اسْتِتَابَةِ الْمُرْتَدِّينَ وَ الْمُعَانِدِينَ وَ قِتَالِهِمْ

# 89 – Mürtədlərin və inadkar kafirlərin tövbə etməyə çağırılması və onlarla vuruşmaq kitabı

## ١ – باب: إِثْمُ مَنْ أَشْرَكَ بِاللَّهِ

## 1-ci fəsil. Allaha şərik qoşan kimsənin günahı

٢١٦٦ – عَنْ ابْنِ مَسْعُود ﷺ قَالَ: قَالَ رَجُلٌ يَا رَسُولَ اللَّهِ أَنُؤَاخَذُ بِمَا عَمِلْنَا فِي الْجَاهِلِيَّة قَالَ مَنْ أَحْسَنَ فِي الإِسْلاَمِ لَمْ يُؤَاخَذْ بِمَا عَمِلَ فِي الْجَاهِلِيَّةِ وَمَنْ أَسَاءَ فِي الإِسْلاَمِ أُخِذَ بِالأَوَّلِ وَالآخِرِ. [رواه البخاري: ٦٩٢١]

**2166.** Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: “(Bir dəfə) bir nəfər (Peyğəmbərə ﷺ) dedi: “Ya Rəsulullah, biz cahiliyyə dövründə etdiyimiz əməllərə görə cəzalandırılacağıqmı?” Peyğəmbər ﷺ buyurdu: “Müsəlman olduqdan sonra yaxşı işlər görən hər kəs cahiliyyət dövründə etdiyi əməllərə görə qınanmaz. Müsəlman olduğu halda günah işlərdən əl çəkməyən kimsəyə gəldikdə isə, o, həm keçmiş, həm də gələcək günahlarına görə cəzalandırılar.” (əl-Buxari, 6921)

# ٩٠ – كِتَابُ التَّعْبِيرِ

# 90 – Yuxu yozmaq kitabı

## ١ – باب: رُؤْيَا الصَّالِحِينَ

## 1-ci fəsil. Əməlisaleh insanların yuxuları

٢١٦٧ – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ الرُّؤْيَا الْحَسَنَةُ مِنَ الرَّجُلِ الصَّالِحِ جُزْءٌ مِنْ سِتَّةٍ وَأَرْبَعِينَ جُزْءًا مِنَ النُّبُوَّةِ. [رواه البخاري: ٦٩٨٣]

**2167.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əməlisaleh adamın gördüyü gözəl yuxu peyğəmbərliyin qırx altı qismindən biridir." (əl-Buxari, 6983)

## ٢ – باب: الرُّؤْيَا مِنَ اللَّهِ

## 2-ci fəsil. (Gözəl) yuxu Allahdandır

٢١٦٨ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ أَنَّهُ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ: إِذَا رَأَى أَحَدُكُمْ رُؤْيَا يُحِبُّهَا فَإِنَّمَا هِيَ مِنَ اللَّهِ فَلْيَحْمَدِ اللَّهَ عَلَيْهَا وَلْيُحَدِّثْ بِهَا وَإِذَا رَأَى غَيْرَ ذَلِكَ مِمَّا يَكْرَهُ فَإِنَّمَا هِيَ مِنَ الشَّيْطَانِ فَلْيَسْتَعِذْ مِنْ شَرِّهَا وَلاَ يَذْكُرْهَا لأَحَدٍ فَإِنَّهَا لاَ تَضُرُّهُ. [رواه البخاري: ٦٩٨٥]

**2168.** Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Sizdən biriniz xoşagələn bir yuxu görsə, (bilsin ki,) bu ancaq Allahdandır. Belə olduğu təqdirdə Allahı həmd-səna ilə təqdis etsin və onu (istədiyi) adamlara danışsın. Və əgər başqa bir xoşagəlməz yuxu görərsə, (bilsin ki,) bu ancaq şeytan tərəfindəndir. Belə olduğu halda həmin yuxunun şərindən (Allaha) sığınsın və onu heç kəsə danışmasın. (Belə etsə,) o yuxu ona zərər verə bilməz." (əl-Buxari, 6985)

## ٣ – باب: الْمُبَشِّرَاتُ

## 3-cü fəsil. Müjdələr

٢١٦٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ لَمْ يَبْقَ مِنَ النُّبُوَّةِ إِلاَّ الْمُبَشِّرَاتُ قَالُوا وَمَا الْمُبَشِّرَاتُ قَالَ الرُّؤْيَا الصَّالِحَةُ. [رواه البخاري: ٦٩٩٠]

**2169.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Peyğəmbərlikdən yalnız müjdələr qalmışdır." (Əshabələr): "Müjdələr nədir?"– deyə soruşdular. Peyğəmbər ﷺ: "Gözəl yuxudur!"– deyə cavab verdi." (əl-Buxari, 6990)

## ٤ – باب: مَنْ رَأَى النَّبِيَّ ﷺ فِي الْمَنَامِ

## 4-cü fəsil. Peyğəmbəri ﷺ yuxuda görən kimsə haqqında

٢١٧٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: مَنْ رَآنِي فِي الْمَنَامِ فَسَيَرَانِي فِي الْيَقَظَةِ وَلاَ يَتَمَثَّلُ الشَّيْطَانُ بِي. [رواه البخاري: ٦٩٩٣]

**2170.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Məni yuxusunda görən kimsə ayıq vaxtı da görəcəkdir[1], çünki şeytan mənim qiyafəmə girə bilməz." (əl-Buxari, 6993)

٢١٧١ – عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ﷺ سَمِعَ النَّبِيَّ ﷺ يَقُولُ: مَنْ رَآنِي فَقَدْ رَأَى الْحَقَّ فَإِنَّ الشَّيْطَانَ لاَ يَتَكَوَّنُنِي. [رواه البخاري: ٦٩٩٧]

**2171.** Əbu Səid əl-Xudri ﷺ rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Məni yuxusunda görən kimsə həqiqəti görmüş olar. Çünki şeytan mənim surətimdə görünə bilməz." (əl-Buxari, 6997)

## 5-ci fəsil. Gündüz vaxtı yuxu görmək

## ٥– باب: الرُّؤْيَا بِالنَّهَارِ

٢١٧٢ – عَنْ أَنَسَ بْنَ مَالِكٍ ﷺ قَالَ: كَانَ رَسُولُ اللَّهِ ﷺ يَدْخُلُ عَلَى أُمِّ حَرَامٍ بِنْتِ مِلْحَانَ وَكَانَتْ تَحْتَ عُبَادَةَ بْنِ الصَّامِتِ فَدَخَلَ عَلَيْهَا يَوْمًا فَأَطْعَمَتْهُ وَجَعَلَتْ تَفْلِي رَأْسَهُ فَنَامَ رَسُولُ اللَّهِ ﷺ ثُمَّ اسْتَيْقَظَ وَهُوَ يَضْحَكُ قَالَتْ فَقُلْتُ مَا يُضْحِكُكَ يَا رَسُولَ اللَّهِ قَالَ نَاسٌ مِنْ أُمَّتِي عُرِضُوا عَلَيَّ غُزَاةً فِي سَبِيلِ اللَّهِ يَرْكَبُونَ ثَبَجَ هَذَا الْبَحْرِ مُلُوكًا عَلَى الأَسِرَّةِ أَوْ مِثْلَ الْمُلُوكِ عَلَى الأَسِرَّةِ شَكَّ إِسْحَاقُ قَالَتْ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ فَدَعَا لَهَا رَسُولُ اللَّهِ ﷺ ثُمَّ وَضَعَ رَأْسَهُ ثُمَّ اسْتَيْقَظَ وَهُوَ يَضْحَكُ فَقُلْتُ مَا يُضْحِكُكَ يَا رَسُولَ اللَّهِ قَالَ نَاسٌ مِنْ أُمَّتِي عُرِضُوا عَلَيَّ غُزَاةً فِي سَبِيلِ اللَّهِ كَمَا قَالَ فِي الأُولَى قَالَتْ فَقُلْتُ يَا رَسُولَ اللَّهِ ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ قَالَ أَنْتِ مِنَ الأَوَّلِينَ فَرَكِبَتْ الْبَحْرَ فِي زَمَانِ مُعَاوِيَةَ بْنِ أَبِي سُفْيَانَ فَصُرِعَتْ عَنْ دَابَّتِهَا حِينَ خَرَجَتْ مِنَ الْبَحْرِ فَهَلَكَتْ. [رواه البخاري: ٧٠٠٢]

**2172.** Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Peyğəmbər ﷺ vaxtaşırı Ummu Həram bint Milhanın yanına gedərdi. Ummu Həram Ubadə ibn Samitin həyat yoldaşı idi. Yenə bir gün Peyğəmbər ﷺ onun yanına gəldi. Qadın ona yemək verdi və onun saçlarını təmizləməyə başladı. Sonra Peyğəmbər ﷺ (uzanıb) yatdı. (Az keçmədən Peyğəmbər ﷺ) yuxudan oyanıb gülməyə başladı. Ummu Həram soruşdu: "Niyə gülürsən, ya Rəsulullah?" Peyğəmbər ﷺ dedi: "Yuxuda mənə ümmətimdən bir dəstə mücahidin bu dənizin ortasında taxtlar üzərində oturmuş hökmdarlar kimi (və ya taxtlar üzərində olan hökmdarlara bənzər) Allah yolunda dəniz döyüşünə çıxdığı göstərildi." Ummu Həram: "Ya Rəsulullah, Allaha dua et, mənə onların arasında olmağı nəsib etsin"– dedi, Peyğəmbər ﷺ də onun üçün dua etdi. Sonra Peyğəmbər ﷺ uzanıb yatdı və (çox keçmədən) yuxudan oyanıb (yenə) gülməyə başladı."

(Ummu Həram dedi): "Mən soruşdum: "Niyə gülürsən, ya Rəsulullah?" Peyğəmbər ﷺ: "Yuxuda mənə ümmətimdən bir dəstə adamın Allah yolunda döyüşə çıxdığı göstərildi..."– deyə əvvəlki sözləri ona təkrar etdi. Mən dedim: "Ya Rəsulullah, Allaha dua et, mənə onların arasında olmağı nəsib etsin." Peyğəmbər ﷺ dedi: "Sən əvvəlkilərin[2] arasında olacaqsan."

---

[1] Yəni sanki ayıq ikən Peyğəmbəri ﷺ görmüşdür.
[2] 1258-ci hədisə bax.

Müaviyə ibn Əbu Süfyanın xilafəti dövründə Ummu Həram dəniz döyüşündə iştirak etmiş və sahilə çıxdıqda atından yerə yıxılıb ölmüşdür." (əl-Buxari, 7002)

## ٦- باب: الْقَيْدُ فِي الْمَنَامِ

## 6-cı fəsil. Yuxuda zəncirləndiyini görən (kimsə)

٢١٧٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ إِذَا اقْتَرَبَ الزَّمَانُ لَمْ تَكَدْ تَكْذِبُ رُؤْيَا الْمُؤْمِنِ وَرُؤْيَا الْمُؤْمِنِ جُزْءٌ مِنْ سِتَّةٍ وَأَرْبَعِينَ جُزْءًا مِنَ النُّبُوَّةِ وَمَا كَانَ مِنَ النُّبُوَّةِ فَإِنَّهُ لاَ يَكْذِبُ. [رواه البخاري: ٧٠١٧]

**2173.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Qiyamət yaxınlaşdığı zaman möminin yuxuları demək olar ki, həmişə doğru çıxacaq. (Çünki) möminin yuxusu peyğəmbərliyin qırx altı qismindən biridir. Peyğəmbərliyə aid olan bir şey isə yalan ola bilməz." (əl-Buxari, 7017)

## ٧- باب: إِذَا رَأَى أَنَّهُ أَخْرَجَ الشَّيْءَ مِنْ كُورَةٍ فَأَسْكَنَهُ مَوْضِعًا آخَرَ

## 7-ci fəsil. Bir kimsənin yuxuda bir şeyi bir nahiyədən götürüb başqa bir yerə yerləşdirməsi

٢١٧٤ – عَنْ عَبْدِ اللَّهِ بْنِ عُمَرَ ﷺ أَنَّ النَّبِيَّ ﷺ قَالَ رَأَيْتُ كَأَنَّ امْرَأَةً سَوْدَاءَ ثَائِرَةَ الرَّأْسِ خَرَجَتْ مِنَ الْمَدِينَةِ حَتَّى قَامَتْ بِمَهْيَعَةَ وَهِيَ الْجُحْفَةُ فَأَوَّلْتُ أَنَّ وَبَاءَ الْمَدِينَةِ نُقِلَ إِلَيْهَا. [رواه البخاري: ٧٠٣٨]

**2174.** Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ﷺ dedi: "Yuxuda mənə saçları dağınıq bir zənci qadının Mədinədən yola düşüb Məhyaədə (yəni Cuhfədə) dayandığı göstərildi. Mən bu yuxunu Mədinədə yayılmış vəba xəstəliyinin o yerlərə getməsinə yozdun." (əl-Buxari, 7038)

## ٨- باب: مَنْ كَذَبَ فِي حُلُمِهِ

## 8-ci fəsil. Görmədiyi bir yuxunu gördüyünü iddia edən kimsə haqqında

٢١٧٥ – عَنِ ابْنِ عَبَّاسٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: مَنْ تَحَلَّمَ بِحُلُمٍ لَمْ يَرَهُ كُلِّفَ أَنْ يَعْقِدَ بَيْنَ شَعِيرَتَيْنِ وَلَنْ يَفْعَلَ وَمَنِ اسْتَمَعَ إِلَى حَدِيثِ قَوْمٍ وَهُمْ لَهُ كَارِهُونَ أَوْ يَفِرُّونَ مِنْهُ صُبَّ فِي أُذُنِهِ الآنُكُ يَوْمَ الْقِيَامَةِ وَمَنْ صَوَّرَ صُورَةً عُذِّبَ وَكُلِّفَ أَنْ يَنْفُخَ فِيهَا وَلَيْسَ بِنَافِخٍ. [رواه البخاري: ٧٠٤٢]

**2175.** İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim özündən bir yuxu uydursa, (Qiyamət günü) ona iki arpa dənəsini bir-birinə calaşdırmaq buyurular, ancaq o, bu dənələri heç vaxt calaşdıra bilməz. Kim aralarında olan söhbəti heç kəsə bildirmək istəməyən və ya bunu öyrənmək istəyən kimsədən qaçan adamların söhbətinə qulaq assa, Qiyamət günü onun qulaqlarına əridilmiş qurğuşun tökülər. Kim (canlıya aid) bir şəkil çəksə, əzaba düçar olar, özünə də həmin şəklə ruh vermək buyurular, lakin o bu şəklə ruh verə bilməz." (əl-Buxari, 7042)

٢١٧٦ – عَنْ ابْنِ عُمَرَ رضي الله عنهما أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: إِنَّ مِنْ أَفْرَى الْفِرَى أَنْ يُرِيَ عَيْنَيْهِ مَا لَمْ تَرَ. [رواه البخاري: ٧٠٤٣]

**2176.** İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yalanların ən böyüyü bir adamın yuxuda görmədiyi bir şeyi gözləri ilə gördüyünü iddia etməsidir." (əl-Buxari, 7043)

## 9-cu fəsil. Yuxunu hamıdan əvvəl yozan kimsənin yuxunu düzgün yozmadığını hesab edən kimsə haqqında

## ٩– باب: مَنْ لَمْ يَرَ الرُّؤْيَا لأَوَّلِ عَابِرٍ إِذَا لَمْ يُصِبْ

٢١٧٧ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما كَانَ يُحَدِّثُ أَنَّ رَجُلاً أَتَى رَسُولَ اللَّهِ ﷺ فَقَالَ إِنِّي رَأَيْتُ اللَّيْلَةَ فِي الْمَنَامِ ظُلَّةً تَنْطُفُ السَّمْنَ وَالْعَسَلَ فَأَرَى النَّاسَ يَتَكَفَّفُونَ مِنْهَا فَالْمُسْتَكْثِرُ وَالْمُسْتَقِلُّ وَإِذَا سَبَبٌ وَاصِلٌ مِنْ الأَرْضِ إِلَى السَّمَاءِ فَأَرَاكَ أَخَذْتَ بِهِ فَعَلَوْتَ ثُمَّ أَخَذَ بِهِ رَجُلٌ آخَرُ فَعَلاَ بِهِ ثُمَّ أَخَذَ بِهِ رَجُلٌ آخَرُ فَعَلاَ بِهِ ثُمَّ أَخَذَ بِهِ رَجُلٌ آخَرُ فَانْقَطَعَ ثُمَّ وُصِلَ فَقَالَ أَبُو بَكْرٍ يَا رَسُولَ اللَّهِ بِأَبِي أَنْتَ وَاللَّهِ لَتَدَعَنِّي فَأَعْبُرَهَا فَقَالَ النَّبِيُّ ﷺ اعْبُرْهَا قَالَ أَمَّا الظُّلَّةُ فَالإِسْلاَمُ وَأَمَّا الَّذِي يَنْطُفُ مِنْ الْعَسَلِ وَالسَّمْنِ فَالْقُرْآنُ حَلاَوَتُهُ تَنْطُفُ فَالْمُسْتَكْثِرُ مِنْ الْقُرْآنِ وَالْمُسْتَقِلُّ وَأَمَّا السَّبَبُ الْوَاصِلُ مِنْ السَّمَاءِ إِلَى الأَرْضِ فَالْحَقُّ الَّذِي أَنْتَ عَلَيْهِ تَأْخُذُ بِهِ فَيُعْلِيكَ اللَّهُ ثُمَّ يَأْخُذُ بِهِ رَجُلٌ مِنْ بَعْدِكَ فَيَعْلُو بِهِ ثُمَّ يَأْخُذُ بِهِ رَجُلٌ آخَرُ فَيَعْلُو بِهِ ثُمَّ يَأْخُذُهُ رَجُلٌ آخَرُ فَيَنْقَطِعُ بِهِ ثُمَّ يُوَصَّلُ لَهُ فَيَعْلُو بِهِ فَأَخْبِرْنِي يَا رَسُولَ اللَّهِ بِأَبِي أَنْتَ أَصَبْتُ أَمْ أَخْطَأْتُ قَالَ النَّبِيُّ ﷺ أَصَبْتَ بَعْضًا وَأَخْطَأْتَ بَعْضًا قَالَ فَوَاللَّهِ يَا رَسُولَ اللَّهِ لَتُحَدِّثَنِّي بِالَّذِي أَخْطَأْتُ قَالَ لاَ تُقْسِمْ. [رواه البخاري: ٧٠٤٦]

**2177.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, (bir dəfə) bir nəfər Peyğəmbərin ﷺ yanına gəlib dedi: "Mən bu gecə yuxuda bir bulud gördüm. Ondan (yerə) yağ və bal damırdı. Habelə insanların bunu ovuclarına yığdığını da gördüm. Kimisi çox, kimisi də az yığmışdı. Birdən yerdən göyə bir ip çəkdilər və mən sənin bu ipdən tutub yuxarı qalxdığını gördüm. Sonra başqa bir adam bu ipdən tutub yuxarı qalxdı. Onun ardından başqa birisi bu ipdən tutub yuxarı qalxdı. Daha sonra bir nəfər bu ipdən tutub qalxmaq istədi, lakin ip qırıldı. Amma sonra yenə birləşdi." Bu vaxt Əbu Bəkr dedi: "Ya Rəsulullah, atam-anam sənə qurban, izn versən, mən onu yozaram." Peyğəmbər ﷺ: "Yoz!"- deyə buyurdu. Əbu Bəkr dedi: "Bulud İslam dinidir. Ondan damla-damla axan yağ və bal isə Qurandır. (Bu) onun şirəsidir damır. Qurandan kimi çox, kimi də az faydalanacaqdır. Göydən yerə çəkilmiş ip isə sənin üzərində olduğun haqdır. Sən bu ipdən tutursan, Allah da səni yüksəldir. Səndən sonra başqa bir adam bu ipdən tutacaq və onun sayəsində yüksələcək. Onun ardınca başqa birisi bu ipdən tutacaq və o da onun sayəsində yüksələcək. Sonra başqa birisi bu ipdən tutacaq, lakin ip qırılacaq. Daha sonra ip birləşəcək və həmin adam da onun sayəsində yüksələcəkdir. Atam-anam sənə qurban ya Rəsulullah, de görüm, mən düz yozdum, yoxsa xətaya yol verdim?" Peyğəmbər ﷺ dedi: "Bəzisini düz yozdun, bəzisini yox." Əbu Bəkr dedi: "Vallahi, ya Rəsulullah, hansında xəta etdiyimi mənə deməlisən." Peyğəmbər ﷺ: "And vermə!"– deyə buyurdu." (əl-Buxari, 7046)

# ٩١ – كِتَابُ الفِتَنِ

# 91 – Fitnələr kitabı

## ١ – باب: قَوْلُ النَّبِيِّ ﷺ سَتَرَوْنَ بَعْدِي أُمُورًا تُنْكِرُونَهَا

## 1-ci fəsil. Peyğəmbərin ﷺ: "Məndən sonra xoşunuza gəlməyəcək bir çox şeylər görəcəksiniz" sözü

٢١٧٨ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَنْ كَرِهَ مِنْ أَمِيرِهِ شَيْئًا فَلْيَصْبِرْ فَإِنَّهُ مَنْ خَرَجَ مِنْ السُّلْطَانِ شِبْرًا مَاتَ مِيتَةً جَاهِلِيَّةً. [رواه البخاري: ٧٠٥٣]

**2178.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim öz rəhbərinin xoşagəlməz bir hərəkətini görsə, qoy (buna) səbir etsin. Çünki kim əmirin itaətindən bircə qarış kənara çıxıb (ölərsə), cahilliyət dövründə olduğu kimi ölmüş olar." (əl-Buxari, 7053)

٢١٧٩ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما عَنْ النَّبِيِّ ﷺ قَالَ: مَنْ رَأَى مِنْ أَمِيرِهِ شَيْئًا يَكْرَهُهُ فَلْيَصْبِرْ عَلَيْهِ فَإِنَّهُ مَنْ فَارَقَ الْجَمَاعَةَ شِبْرًا فَمَاتَ إِلاَّ مَاتَ مِيتَةً جَاهِلِيَّةً. [رواه البخاري: ٧٠٥٤]

**2179.** İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim öz rəhbərinin xoşagəlməz bir hərəkətini görsə, qoy buna səbir etsin. Çünki kim (müsəlman) camaatından bircə qarış kənara çıxıb ölərsə, cahilliyət dövründə olduğu kimi ölmüş olar." (əl-Buxari, 7054)

٢١٨٠ – عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ رضي الله عنه قَالَ: دَعَانَا النَّبِيُّ ﷺ فَبَايَعْنَاهُ فَقَالَ فِيمَا أَخَذَ عَلَيْنَا أَنْ بَايَعَنَا عَلَى السَّمْعِ وَالطَّاعَةِ فِي مَنْشَطِنَا وَمَكْرَهِنَا وَعُسْرِنَا وَيُسْرِنَا وَأَثَرَةً عَلَيْنَا وَأَنْ لاَ نُنَازِعَ الأَمْرَ أَهْلَهُ إِلاَّ أَنْ تَرَوْا كُفْرًا بَوَاحًا عِنْدَكُمْ مِنْ اللَّهِ فِيهِ بُرْهَانٌ. [رواه البخاري: ٧٠٥٦]

**2180.** Rəvayət edilir ki, Ubadə ibn Samit رضي الله عنه demişdir: "(Bir dəfə) Peyğəmbər ﷺ bizi öz yanına çağırdı və biz ona beyət etdik. Xoş günümüzdə və sıxıntı anlarımızda, düşdüyümüz çətin və asan hallarda, habelə haqqımızı ödəməsələr belə, (əmirləri) dinləyib itaət edəcəyimizə dair ona beyət etdik. Habelə, əmirə qarşı çıxmayacağımıza söz verdik. Yalnız əmirin açıq-aşkar küfr etməsi və buna dair Allah tərəfindən dəlil-sübutun olması istisnadır." (əl-Buxari, 7056)

## ٢ – باب: ظُهُورُ الْفِتَنِ

## 2-ci fəsil. Fitnələrin meydana çıxması

٢١٨١ – عَنْ ابْنِ مَسْعُودٍ رضي الله عنه قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: مِنْ شِرَارِ النَّاسِ مَنْ تُدْرِكْهُمْ السَّاعَةُ وَهُمْ أَحْيَاءٌ. [رواه البخاري: ٧٠٦٧]

**2181.** Rəvayət edilir ki, ibn Məsud رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "İnsanların ən pisi Qiyamətin qopduğu gün həyatda olub (bunun şahidi olan) kimsələrdir." (əl-Buxari, 7067)

### 3-cü fəsil. Elə bir zaman gəlməyəcək ki, onun ardından gələn ondan daha acınacaqlı olmasın

### ٣- باب: لاَ يَأْتِي زَمَانٌ إِلاَّ الَّذِي بَعْدَهُ شَرٌّ مِنْهُ

٢١٨٢ – عَنْ الزُّبَيْرِ بْنِ عَدِيٍّ قَالَ: أَتَيْنَا أَنَسَ بْنَ مَالِكٍ ﷺ فَشَكَوْنَا إِلَيْهِ مَا نَلْقَى مِنْ الْحَجَّاجِ فَقَالَ: اصْبِرُوا فَإِنَّهُ لاَ يَأْتِي عَلَيْكُمْ زَمَانٌ إِلاَّ الَّذِي بَعْدَهُ شَرٌّ مِنْهُ حَتَّى تَلْقَوْا رَبَّكُمْ سَمِعْتُهُ مِنْ نَبِيِّكُمْ ﷺ. [رواه البخاري: ٧٠٦٨]

**2182.** Rəvayət edilir ki, Zubeyr ibn Adiy demişdir: "(Bir dəfə) Ənəs ibn Malikin ﷺ yanına gəlib ona Həccacın bizə verdiyi əziyyətlərdən şikayət etdik. (Ənəs) dedi: "Səbir edin! Çünki siz Rəbbinizə qovuşanadək yaşayacağınız hər sonrakı gün əvvəlkindən daha acınacaqlı olacaq. Mən bunu sizin Peyğəmbərinizdən ﷺ eşitmişəm." (əl-Buxari, 7068)

### 4-cü fəsil. Peyğəmbərin ﷺ: "Bizə qarşı silah qaldıran adam bizdən deyildir" sözü

### ٤- باب: قَوْلُ النَّبِيِّ ﷺ مَنْ حَمَلَ عَلَيْنَا السِّلاَحَ فَلَيْسَ مِنَّا

٢١٨٣ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: لاَ يُشِيرُ أَحَدُكُمْ عَلَى أَخِيهِ بِالسِّلاَحِ فَإِنَّهُ لاَ يَدْرِي لَعَلَّ الشَّيْطَانَ يَنْزِعُ فِي يَدِهِ فَيَقَعُ فِي حُفْرَةٍ مِنْ النَّارِ. [رواه البخاري: ٧٠٧٢]

**2183.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən heç biriniz (din) qardaşının üstünə silah qaldırmasın. Çünki o, (nə baş verəcəyini) bilə bilməz, ola bilsin ki, şeytan onun əli ilə qardaşını öldürsün, bununla (bu qatil) Cəhənnəmdəki çuxura düşsün." (əl-Buxari, 7072)

### 5-ci fəsil. Fitnə baş qaldırdığı zaman oturan adam ayaq üstə duran adamdan daha xeyirli olacaq

### ٥- باب: تَكُونُ فِتْنَةٌ الْقَاعِدُ فِيهَا خَيْرٌ مِنْ الْقَائِمِ

٢١٨٤ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ سَتَكُونُ فِتَنٌ الْقَاعِدُ فِيهَا خَيْرٌ مِنْ الْقَائِمِ وَالْقَائِمُ فِيهَا خَيْرٌ مِنْ الْمَاشِي وَالْمَاشِي فِيهَا خَيْرٌ مِنْ السَّاعِي مَنْ تَشَرَّفَ لَهَا تَسْتَشْرِفْهُ فَمَنْ وَجَدَ مِنْهَا مَلْجَأً أَوْ مَعَاذًا فَلْيَعُذْ بِهِ. [رواه البخاري: ٧٠٨٢]

**2184.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "(Vaxt gələcək) fitnələr baş qaldıracaq. O zaman oturan adam ayaq üstə duran adamdan, duran adam yeriyən adamdan və yeriyən adam (fitnəyə) meyil edən adamdan daha xeyirli olacaq. Kim fitnəyə tərəf boylanarsa, o, onu özünə cəlb edər. Odur ki, hər kim ondan canını qurtarmaq üçün bir daldalanacaq və ya bir sığınacaq tapsa, ora sığınsın." (əl-Buxari, 7082)

### 6-cı fəsil. Fitnə baş qaldırdığı zaman bədəvilərin yanında qalmaq

### ٦- باب: التَّعَرُّبُ فِي الْفِتْنَةِ

٢١٨٥ – عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ﷺ أَنَّهُ دَخَلَ عَلَى الْحَجَّاجِ فَقَالَ يَا ابْنَ الأَكْوَعِ ارْتَدَدْتَ عَلَى عَقِبَيْكَ تَعَرَّبْتَ قَالَ لاَ وَلَكِنَّ رَسُولَ اللَّهِ ﷺ أَذِنَ لِي فِي الْبَدْوِ. [رواه البخاري: ٧٠٨٧]

**2185.** Rəvayət edilir ki, Sələmə ibn Əkva ﷺ Həccacın yanına gəldikdə Həccac ona demişdir: “Ey ibn Əkva, deyəsən, dinindən dönmüsən, bədəvilərin yanında yaşayırsan.” Sələmə dedi: “Xeyr (dinimdən dönməmişəm), lakin Peyğəmbər ﷺ mənə çöldə yaşamağa izn vermişdir.” (əl-Buxari, 7187)

### 7-ci fəsil. Allahın (hər hansı) bir xalqa əzab göndərməsi

### ٧- باب: إِذَا أَنْزَلَ اللَّهُ بِقَوْمٍ عَذَابًا

٢١٨٦ – عَنِ ابْنِ عُمَرَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ إِذَا أَنْزَلَ اللَّهُ بِقَوْمٍ عَذَابًا أَصَابَ الْعَذَابُ مَنْ كَانَ فِيهِمْ ثُمَّ بُعِثُوا عَلَى أَعْمَالِهِمْ. [رواه البخاري: ٧١٠٨]

**2186.** İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allah bir xalqa əzab göndərəndə bu əzab onların arasında olan kimsələri də bürüyür, sonra isə həmin adamlar əməllərinə görə həşr olunurlar.” (əl-Buxari, 7108)

### 8-ci fəsil. Bir toplumun yanında bir söz danışan, onların yanından çıxandan sonra başqa söz danışan kimsə haqqında

### ٨- باب: إِذَا قَالَ عِنْدَ قَوْمٍ شَيْئًا ثُمَّ خَرَجَ فَقَالَ بِخِلاَفِهِ

٢١٨٧ – عَنْ حُذَيْفَةَ ﷺ قَالَ: إِنَّمَا كَانَ النِّفَاقُ عَلَى عَهْدِ النَّبِيِّ ﷺ فَأَمَّا الْيَوْمَ فَإِنَّمَا هُوَ الْكُفْرُ بَعْدَ الإِيمَانِ. [رواه البخاري: ٧١١٤]

**2187.** Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: “Münafiqlik Peyğəmbərin ﷺ zamanında olmuşdur. Bu gün isə münafiqlik imandan sonra küfrdür.” (əl-Buxari, 7114)

### 9-cu fəsil. Atəşin çıxması

### ٩- باب: خُرُوجُ النَّارِ

٢١٨٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: لاَ تَقُومُ السَّاعَةُ حَتَّى تَخْرُجَ نَارٌ مِنْ أَرْضِ الْحِجَازِ تُضِيءُ أَعْنَاقَ الإِبِلِ بِبُصْرَى. [رواه البخاري: ٧١١٨]

**2188.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Hicaz torpağından od çıxıb Busradakı[1] dəvələrin boyunlarını işıqlandırmayınca, Qiyamət qopmayacaq.” (əl-Buxari, 7118)

---

[1] Busra: Suriyanın cənubunda olan şəhərdir. Bu, Qiyamətin kiçik əlamətlərindən biridir. Bu hadisə artıq hicri-qəməri tarixlə 654-cü ildə baş vermişdir.

٢١٨٩ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ يُوشِكُ الْفُرَاتُ أَنْ يَحْسِرَ عَنْ كَنْزٍ مِنْ ذَهَبٍ فَمَنْ حَضَرَهُ فَلاَ يَأْخُذْ مِنْهُ شَيْئًا. [رواه البخاري: ٧١١٩]

**2189.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Tezliklə Furat çayının (suyu çəkiləcək və) qızıldan olan xəzinə üzə çıxacaqdır. Kim o zaman yaşayacaqsa, ondan heç bir şey götürməsin." (əl-Buxari, 7119)

## 10-cu fəsil ١٠– باب

٢١٩٠ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ لاَ تَقُومُ السَّاعَةُ حَتَّى تَقْتَتِلَ فِئَتَانِ عَظِيمَتَانِ يَكُونُ بَيْنَهُمَا مَقْتَلَةٌ عَظِيمَةٌ دَعْوَتُهُمَا وَاحِدَةٌ وَحَتَّى يُبْعَثَ دَجَّالُونَ كَذَّابُونَ قَرِيبٌ مِنْ ثَلاَثِينَ كُلُّهُمْ يَزْعُمُ أَنَّهُ رَسُولُ اللَّهِ وَحَتَّى يُقْبَضَ الْعِلْمُ وَتَكْثُرَ الزَّلاَزِلُ وَيَتَقَارَبَ الزَّمَانُ وَتَظْهَرَ الْفِتَنُ وَيَكْثُرَ الْهَرْجُ وَهُوَ الْقَتْلُ وَحَتَّى يَكْثُرَ فِيكُمُ الْمَالُ فَيَفِيضَ حَتَّى يُهِمَّ رَبَّ الْمَالِ مَنْ يَقْبَلُ صَدَقَتَهُ وَحَتَّى يَعْرِضَهُ عَلَيْهِ فَيَقُولَ الَّذِي يَعْرِضُهُ عَلَيْهِ لاَ أَرَبَ لِي بِهِ وَحَتَّى يَتَطَاوَلَ النَّاسُ فِي الْبُنْيَانِ وَحَتَّى يَمُرَّ الرَّجُلُ بِقَبْرِ الرَّجُلِ فَيَقُولُ يَا لَيْتَنِي مَكَانَهُ وَحَتَّى تَطْلُعَ الشَّمْسُ مِنْ مَغْرِبِهَا فَإِذَا طَلَعَتْ وَرَآهَا النَّاسُ يَعْنِي آمَنُوا أَجْمَعُونَ فَذَلِكَ حِينَ ﴿لَا يَنفَعُ نَفْسًا إِيمَٰنُهَا لَمْ تَكُنْ ءَامَنَتْ مِن قَبْلُ أَوْ كَسَبَتْ فِىٓ إِيمَٰنِهَا خَيْرًا﴾ وَلَتَقُومَنَّ السَّاعَةُ وَقَدْ نَشَرَ الرَّجُلاَنِ ثَوْبَهُمَا بَيْنَهُمَا فَلاَ يَتَبَايَعَانِهِ وَلاَ يَطْوِيَانِهِ وَلَتَقُومَنَّ السَّاعَةُ وَقَدِ انْصَرَفَ الرَّجُلُ بِلَبَنِ لِقْحَتِهِ فَلاَ يَطْعَمُهُ وَلَتَقُومَنَّ السَّاعَةُ وَهُوَ يُلِيطُ حَوْضَهُ فَلاَ يَسْقِي فِيهِ وَلَتَقُومَنَّ السَّاعَةُ وَقَدْ رَفَعَ أُكْلَتَهُ إِلَى فِيهِ فَلاَ يَطْعَمُهَا. [رواه البخاري: ٧١٢١]

**2190.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Amalı eyni olan iki böyük ordu bir-birilə vuruşmayınca qiyamət qopmayacaq. Onların arasında böyük bir döyüş olacaqdır. Nəhayət, otuza yaxın yalançı dəccal meydana çıxacaq və onlardan hər biri Allahın rəsulu olduğunu iddia edəcəkdir. Habelə, elm aradan qaldırılmayınca[1], zəlzələlər çoxalmayınca, zaman yaxınlaşmayınca[2], fitnələr baş qaldırmayınca, hərc – yəni qətl hadisələri artmayınca, əlinizdə olan var-dövlət artmayınca (qiyamət qopmayacaq). İş o yerə gəlib çatacaq ki, mal sahibi zəkatını verməyə adam axtaracaq, hətta onu bir kimsəyə təklif etdikdə həmin adam: "Mənim zəkata ehtiyacım yoxdur"– deyəcəkdir. Həmçinin, insanlar hündür binalar tikməkdə bir-biriləri ilə yarışmayınca, adam birisinin qəbrinin yanından keçdikdə: "Kaş mən onun yerində olaydım" deməyincə, günəş batdığı yerdən doğmayınca[3] (qiyamət qopmayacaq). Günəş (məğribdən) doğduğu zaman insanlar onu görəcək, yəni hamısı (bu həqiqətə) inanacaq, (lakin artıq iş işdən keçmiş olacaq). Həmin vaxt: **"....əvvəlcə iman gətirməmiş və ya imanında bir xeyir qazanmamış kimsəyə iman gətirməsi fayda verməyəcəkdir"[4].** Qiyamət qopacağı zaman parçalarını qarşılarına sərmiş iki kişi nə alış-verişlərini tamamlamağa, nə də o parçanı büküb yığışdırmağa imkan tapmayacaqlar. Qiyamət qopacağı zaman dəvəsinin südünü sağıb aparan adam o süddən içməyə fürsət tapmayacaq. Qiyamət qopacağı zaman hovuzunu suvayan adama ondan su içmək nəsib olmayacaq. Qiyamət qopacağı zaman loxmasını ağzına aparan adam onu yeməyə macal tapmayacaq." (əl-Buxari, 7121)

---

[1] Yəni alimlər ölüb getməyincə.
[2] Yəni vaxtın bərəkəti azalmayınca.
[3] 1350-ci hədisə bax.
[4] "əl-Ənam" surəsi, 158.

# ٩٢ – كِتَابُ الأَحْكَامِ

# 92 – Hökmlər kitabı

## ١ – باب: السَّمْعُ وَالطَّاعَةُ لِلإِمَامِ مَا لَمْ تَكُنْ مَعْصِيَةً

## 1-ci fəsil. (Allaha) asi olmağı əmr etməyincə, ixtiyar sahibinin (əmrlərini) eşidib ona itaət etmək

**٢١٩١** – عَنْ أَنَسِ بْنِ مَالِكٍ ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّهِ ﷺ اسْمَعُوا وَأَطِيعُوا وَإِنْ اسْتُعْمِلَ عَلَيْكُمْ عَبْدٌ حَبَشِيٌّ كَأَنَّ رَأْسَهُ زَبِيبَةٌ. [رواه البخاري: ٧١٤٢]

**2191.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Üzərinizdə hökmranlıq edən kəs başı kişmişə[1] bənzər həbəşi olsa belə, (əmrlərini) eşidib ona itaət edin." (əl-Buxari, 7142)

## ٢ – باب: مَا يُكْرَهُ مِنْ الْحِرْصِ عَلَى الإِمَارَةِ

## 2-ci fəsil. Vəzifəyə can atmağın bəyənilməməsi

**٢١٩٢** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: إِنَّكُمْ سَتَحْرِصُونَ عَلَى الإِمَارَةِ وَسَتَكُونُ نَدَامَةً يَوْمَ الْقِيَامَةِ فَنِعْمَ الْمُرْضِعَةُ وَبِئْسَتْ الْفَاطِمَةُ. [رواه البخاري: ٧١٤٨]

**2192.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Həqiqətən, siz vəzifəyə can atacaqsınız. Halbuki vəzifə Qiyamət günü peşmançılıq gətirəcək. O, nə gözəl süd verəndir və nə pis süddən kəsəndir.[2]" (əl-Buxari, 7148)

## ٣ – باب: مَنْ اسْتُرْعِيَ رَعِيَّةً فَلَمْ يَنْصَحْ

## 3-cü fəsil. Özünə rəiyyət tapşırıldıqda onların qeydinə qalmayan kimsə haqqında

**٢١٩٣** – عَنْ مَعْقِلِ بْنِ يَسَارٍ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: مَا مِنْ عَبْدٍ اسْتَرْعَاهُ اللَّهُ رَعِيَّةً فَلَمْ يَحُطْهَا بِنَصِيحَةٍ إِلاَّ لَمْ يَجِدْ رَائِحَةَ الْجَنَّةِ. [رواه البخاري: ٧١٥٠]

**2193.** Rəvayət edilir ki, Məqil ibn Yəsar ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Allah Öz qullarından birinə rəiyyətin qeydinə qalmağı həvalə edər və o da onların haqqını ödəməzsə, Cənnətin iyini belə duymaz." (əl-Buxari, 7150)

---

[1] Qara yaxud da qıvrım-qıvrım olduğundan Peyğəmbər ﷺ onu kişmişə bənzətmişdir.

[2] Burada Peyğəmbər ﷺ vəzifədə oturan adamı südəmər körpəyə bənzədir. Belə ki, vəzifə bu dünyada insana istədiyi ləzzətləri almağa imkan verir, ölüb getdikdə isə bu ləzzətlərə son qoyulur və əgər tutduğu vəzifəni haqqı ilə yerinə yetirməmişsə, buna görə peşmançılıq çəkir.

٢١٩٤ – عَنْ مَعْقِلِ بْنِ يَسَارٍ ﷺ عَنِ النَّبِيِّ ﷺ قَالَ: مَا مِنْ وَالٍ يَلِي رَعِيَّةً مِنَ الْمُسْلِمِينَ فَيَمُوتُ وَهُوَ غَاشٌّ لَهُمْ إِلاَّ حَرَّمَ اللَّهُ عَلَيْهِ الْجَنَّةَ. [رواه البخاري: ٧١٥١]

**2194.** Məqil ibn Yəsar ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müsəlman xalqına başçılıq etmiş bir kimsə xalqını aldatmış olduğu halda ölərsə, Allah ona Cənnəti haram buyurar." (əl-Buxari, 7151)

### 4-cü fəsil. (İnsanlara) sıxıntı verən kimsəni, Allah sıxıntıya salar

### ٤ – باب: مَنْ شَاقَّ شَقَّ اللَّهُ عَلَيْهِ

٢١٩٥ – عَنْ جُنْدَب ﷺ قَالَ: سَمِعْتُ رَسُولَ اللَّه ﷺ يَقُولُ: مَنْ سَمَّعَ سَمَّعَ اللَّهُ به يَوْمَ الْقيَامَة، قَالَ: وَمَنْ يُشَاقِقْ يَشْقُقْ اللَّهُ عَلَيْه يَوْمَ الْقيَامَة، فَقَالُوا: أَوْصنا فَقَالَ: إِنَّ أَوَّلَ مَا يُنْتِنُ منْ الإِنْسَان بَطْنُهُ فَمَنْ اسْتَطَاعَ أَنْ لاَ يَأْكُلَ إِلاَّ طَيِّبًا فَلْيَفْعَلْ وَمَنْ اسْتَطَاعَ أَنْ لاَ يُحَالَ بَيْنَهُ وَبَيْنَ الْجَنَّة بملْءِ كَفِّه منْ دَمٍ أَهْرَاقَهُ فَلْيَفْعَلْ. [رواه البخاري: ٧١٥٢]

**2195.** Rəvayət edilir ki, Cundəb ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Kim (etdiyi əməli insanlara) eşitdirmək məqsədilə edərsə, Allah onu eşitdirər. Kim (insanlara) sıxıntı verərsə, Qiyamət günü Allah ona sıxıntı verər." (Əshabələr): "Bizə nəsihət et!"– dedilər. Peyğəmbər ﷺ buyurdu: "İnsanın ilk çürüyən bədən üzvü qarnıdır. (Belə isə) kim ancaq halal yolla dolana bilirsə, qoy buna əməl etsin, habelə kim bir ovuc qan tökməklə özünü Cənnətdən uzaqlaşdırmağın qarşısını ala bilirsə, qoy bunu etsin." (əl-Buxari, 7152)

### 5-ci fəsil. Qazi qəzəbli olduğu halda hökm və ya fitva verə bilərmi?

### ٥ – باب: هَلْ يَقْضِي الْقَاضِي أَوْ يُفْتِي وَهُوَ غَضْبَانُ؟

٢١٩٦ – عَنْ أَبُو بَكْرَةَ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: لاَ يَقْضِيَنَّ حَكَمٌ بَيْنَ اثْنَيْنِ وَهُوَ غَضْبَانُ. [رواه البخاري: ٧١٥٨]

**2196.** Rəvayət edilir ki, Əbu Bəkrə ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Hakim qəzəbli olduğu halda iki nəfərin arasında hökm verməsin!" (əl-Buxari, 7158)

### 6-cı fəsil. İxtiyar sahibinin öz məmurlarına məktub göndərməsi

### ٦ – باب: كِتَابُ الْحَاكِمِ إِلَى عُمَّالِهِ

٢١٩٧ – عَنْ سَهْلِ بْنِ أَبِي حَثْمَةَ ﷺ أَنَّ عَبْدَ اللَّه بْنَ سَهْلٍ وَمُحَيِّصَةَ خَرَجَا إِلَى خَيْبَرَ منْ جَهْد أَصَابَهُمْ فَأُخْبِرَ مُحَيِّصَةُ أَنَّ عَبْدَ اللَّه قُتلَ وَطُرِحَ فِي فَقيرٍ أَوْ عَيْنٍ فَأَتَى يَهُودَ فَقَالَ: أَنْتُمْ وَاللَّه قَتَلْتُمُوهُ قَالُوا مَا قَتَلْنَاهُ وَاللَّه ثُمَّ أَقْبَلَ حَتَّى قَدمَ عَلَى قَوْمه فَذَكَرَ لَهُمْ وَأَقْبَلَ هُوَ وَأَخُوهُ حُوَيِّصَةُ وَهُوَ أَكْبَرُ منْهُ وَعَبْدُ الرَّحْمَنِ بْنُ سَهْلٍ فَذَهَبَ لِيَتَكَلَّمَ

وَهُوَ الَّذي كَانَ بخَيْبَرَ فَقَالَ النَّبيُّ ﷺ لمُحَيِّصَةَ كَبِّرْ كَبِّرْ يُريدُ السِّنَّ فَتَكَلَّمَ حُوَيِّصَةُ ثُمَّ تَكَلَّمَ مُحَيِّصَةُ فَقَالَ رَسُولُ اللَّهِ ﷺ إِمَّا أَنْ يَدُوا صَاحبَكُمْ وَإِمَّا أَنْ يُؤْذنُوا بحَرْب. [رواه البخاري: ٧١٦٢]

**2197.** Səhl ibn Əbu Həsmə ﷺ rəvayət edir ki, (bir dəfə) Abdullah ibn Səhl və Muheyyisə (ibn Zeyd) qıtlıq və aclıq üzündən (xurma almaq üçün) Xeybərə yollandılar. Bir qədər sonra Müheyyisəyə Abdullahın qətlə yetirildiyi və quyuya (yaxud su çuxuruna) atıldığı xəbər verildi. Muheyyisə yəhudilərin yanına gəlib dedi: "Vallahi, onu siz öldürmüsünüz!" Onlar dedilər: "Vallahi ki, onu biz öldürməmişik." Sonra Muheyyisə öz həmqəbilələrinin yanına gəlib başına gələnləri onlara danışdı. Bundan sonra Xeybərdə olmuş Muheyyis, ondan yaşca böyük qardaşı Huveyyisə və Abdur-Rəhman ibn Səhl (hadisə barədə) xəbər vermək üçün (Peyğəmbərin ﷺ yanına gəldilər). (Yaşca hamıdan balaca olan Abdur-Rəhman danışmaq istədikdə) Peyğəmbər ﷺ: "Böyüyünüz (danışsın), böyüyünüz!"– deyə buyurdu. Sonra əvvəlcə Huveyyisə, onun ardınca da Muheyyisə danışmağa başladı. Peyğəmbər ﷺ (onları dinlədikdən sonra) dedi: "Onlar ya qardaşınızı (öldürdüklərinə) görə qanbahası ödəyəcək, ya da bizə hərb elan edəcəklər." (əl-Buxari, 7162)

## 7-ci fəsil. Rəiyyət əmirə necə beyət etməlidir?

## ٧– باب: كَيْفَ يُبَايِعُ الإِمَامُ النَّاسَ

٢١٩٨ – عَنْ عُبَادَةَ بْنِ الصَّامت ﷺ قَالَ: بَايَعْنَا رَسُولَ اللَّه ﷺ عَلَى السَّمْعِ وَالطَّاعَة في الْمَنْشَط وَالْمَكْرَه وَأَنْ لاَ نُنَازِعَ الأَمْرَ أَهْلَهُ وَأَنْ نَقُومَ أَوْ نَقُولَ بالْحَقِّ حَيْثُمَا كُنَّا لاَ نَخَافُ في اللَّه لَوْمَةَ لائمٍ. [رواه البخاري: ٧٢٠٠]

**2198.** Rəvayət edilir ki, Ubadə ibn Samit ﷺ demişdir: "Biz, xoş gündə və sıxıntı anlarında (əmirləri) dinləyib itaət edəcəyimizə, habelə əmirə qarşı çıxmayacağımıza, harada olmuş olsaq heç kəsin tənəsindən qorxmadan Allah yolunda haqqı təbliğ edəcəyimizə (və ya haqqı deyəcəyimizə) dair Peyğəmbərə ﷺ beyət etdik." (əl-Buxari, 7200)

٢١٩٩ – عَنْ عَبْد اللَّه بْنِ عُمَرَ ﷺ قَالَ: كُنَّا إِذَا بَايَعْنَا رَسُولَ اللَّه ﷺ عَلَى السَّمْعِ وَالطَّاعَة يَقُولُ: لَنَا فيمَا اسْتَطَعْتُمْ. [رواه البخاري: ٧٢٠٢]

**2199.** Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "Biz Peyğəmbərə ﷺ onun əmrini eşidib itaət edəcəyimizə dair beyət etdikdə o bizə deyərdi: "Gücünüz yetdiyi qədər (əməl edin)!" (əl-Buxari, 7202)

## 8-ci fəsil. Xəlifə təyin etmək

## ٨– باب: الاسْتخْلاَف

٢٢٠٠ – عَنْ عَبْد اللَّه بْنِ عُمَرَ ﷺ قَالَ: قيلَ لعُمَرَ: أَلاَ تَسْتَخْلفُ؟ قَالَ إِنْ أَسْتَخْلفْ فَقَدْ اسْتَخْلَفَ مَنْ هُوَ خَيْرٌ منِّي أَبُو بَكْرٍ وَإِنْ أَتْرُكْ فَقَدْ تَرَكَ مَنْ هُوَ خَيْرٌ منِّي رَسُولُ اللَّه ﷺ. [رواه البخاري: ٧٢١٨]

**2200.** Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Ömər can üstə olarkən (ona): "Xəlifə təyin etməyəcəksənmi?"– deyə sual verdilər. Dedi: "Əgər xəlifə təyin etsəm, (bilin ki,) məndən daha xeyirlisi – Əbu Bəkr (özündən sonra məni) xəlifə təyin etmişdir. Yox, əgər bunu etməsəm, (bilin ki,) məndən daha xeyirlisi – Allahın elçisi ﷺ bunu etməmişdir. (əl-Buxari, 7218)

## 9-cu fəsil

## ٩– باب

**٢٢٠١** – عَنْ جَابرَ بْنَ سَمُرَةَ ﵁ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: يَكُونُ اثْنَا عَشَرَ أَمِيرًا فَقَالَ كَلِمَةً لَمْ أَسْمَعْهَا فَقَالَ أَبِي إِنَّهُ قَالَ كُلُّهُمْ مِنْ قُرَيْشٍ. [رواه البخاري: ٧٢٢٢-٧٢٢٣]

**2201.** Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "(Məndən sonra) on iki əmir olacaq..." Sonra o elə bir söz dedi ki, mən onu eşidə bilmədim. Atam isə demişdir: "Onların hamısı Qureyşdən olacaq." (əl-Buxari, 7222-7223)

# ٩٣ – كِتَابُ التَّمَنِّي

# 93 – Arzu kitabı

## ١ – باب: مَا يُكْرَهُ مِنْ التَّمَنِّي

## 1-ci fəsil. Nəyi arzulamaq bəyənilmir?

**٢٢٠٢** – عَنْ أَنَسٌ ﷺ قَالَ: لَوْلاَ أَنِّي سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ لاَ تَتَمَنَّوْا الْمَوْتَ لَتَمَنَّيْتُ. [رواه البخاري: ٧٢٣٣]

**2202.** Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Əgər mən Peyğəmbərin ﷺ: “Özünüzə ölüm diləməyin!”– dediyini eşitməsəydim, (özümə ölüm) diləyərdim.” (əl-Buxari, 7233)

**٢٢٠٣** – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: لاَ يَتَمَنَّى أَحَدُكُمْ الْمَوْتَ إِمَّا مُحْسِنًا فَلَعَلَّهُ يَزْدَادُ وَإِمَّا مُسِيئًا فَلَعَلَّهُ يَسْتَعْتِبُ. [رواه البخاري: ٧٢٣٥]

**2203.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Sizdən heç kəs özünə ölüm diləməsin. (Əgər o, həyatda qalarsa,) əməlisaleh adamdırsa, yaxşı işlər görüb savabını artırar, yox günahkar adamdırsa, ola bilər ki, tövbə etsin.” (əl-Buxari, 7235)

# ٩٤ – كِتَابُ الاعْتِصَامِ بِالكِتَابِ و السُّنَّةِ

# 94 – Kitab və sünnədən möhkəm yapışmaq kitabı

## ١ – باب: الاقْتِدَاءُ بِسُنَنِ رَسُولِ اللَّهِ ﷺ

## 1-ci fəsil. Peyğəmbərin ﷺ sünnələrinə riayət etmək

٢٢٠٤ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ كُلُّ أُمَّتِي يَدْخُلُونَ الْجَنَّةَ إِلاَّ مَنْ أَبَى قَالُوا يَا رَسُولَ اللَّهِ وَمَنْ يَأْبَى قَالَ مَنْ أَطَاعَنِي دَخَلَ الْجَنَّةَ وَمَنْ عَصَانِي فَقَدْ أَبَى. [رواه البخاري: ٧٢٨٠]

**2204.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ümmətimdən hər kəs Cənnətə daxil olacaq. Yalnız (bundan) imtina edən kimsələrdən başqa." (Əshabələr təəccüblə) soruşdular: "Ya Rəsulullah, kim imtina edəcək?!" Peyğəmbər ﷺ buyurdu: "Mənə itaət edən kimsə Cənnətə girər, mənə asi olan kimsə isə imtina etmiş olar." (əl-Buxari, 7280)

٢٢٠٥ – عَنْ جَابرَ بْنَ عَبْدِ اللَّهِ رضي الله عنهما قَالَ: جَاءَتْ مَلاَئِكَةٌ إِلَى النَّبِيِّ ﷺ وَهُوَ نَائِمٌ فَقَالَ بَعْضُهُمْ إِنَّهُ نَائِمٌ وَقَالَ بَعْضُهُمْ إِنَّ الْعَيْنَ نَائِمَةٌ وَالْقَلْبَ يَقْظَانُ فَقَالُوا إِنَّ لِصَاحِبِكُمْ هَذَا مَثَلاً فَاضْرِبُوا لَهُ مَثَلاً فَقَالَ بَعْضُهُمْ إِنَّهُ نَائِمٌ وَقَالَ بَعْضُهُمْ إِنَّ الْعَيْنَ نَائِمَةٌ وَالْقَلْبَ يَقْظَانُ فَقَالُوا مَثَلُهُ كَمَثَلِ رَجُلٍ بَنَى دَارًا وَجَعَلَ فِيهَا مَأْدُبَةً وَبَعَثَ دَاعِيًا فَمَنْ أَجَابَ الدَّاعِيَ دَخَلَ الدَّارَ وَأَكَلَ مِنَ الْمَأْدُبَةِ وَمَنْ لَمْ يُجِبْ الدَّاعِيَ لَمْ يَدْخُلْ الدَّارَ وَلَمْ يَأْكُلْ مِنَ الْمَأْدُبَةِ فَقَالُوا أَوِّلُوهَا لَهُ يَفْقَهْهَا فَقَالَ بَعْضُهُمْ إِنَّهُ نَائِمٌ وَقَالَ بَعْضُهُمْ إِنَّ الْعَيْنَ نَائِمَةٌ وَالْقَلْبَ يَقْظَانُ فَقَالُوا فَالدَّارُ الْجَنَّةُ وَالدَّاعِي مُحَمَّدٌ ﷺ فَمَنْ أَطَاعَ مُحَمَّدًا ﷺ فَقَدْ أَطَاعَ اللَّهَ وَمَنْ عَصَى مُحَمَّدًا ﷺ فَقَدْ عَصَى اللَّهَ وَمُحَمَّدٌ ﷺ فَرَّقَ بَيْنَ النَّاسِ. [رواه البخاري: ٧٢٨١]

**2205.** Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ yatmış ikən mələklər onun yanına gəldilər. Onlardan bəzisi: "O yatıb"– dedi, bəzisi isə: "(Onun) gözləri yatsa da, qəlbi oyaqdır"– dedi. Sonra onlar dedilər: "Bu dostunuz barədə (yaxşı) bir misal çəkmək olar, gətirin o misalı." Bəziləri: "O yatıb"– dedilər, bəziləri də: "(Onun) gözləri yatsa da, qəlbi oyaqdır"– dedilər. Sonra (mələklər) dedilər: "Onun halı bir ev tikib içində ziyafət verən və insanları yeməyə dəvət edən kimsənin halına bənzəyir. Kim dəvətçinin dəvətini qəbul etsə, evə daxil olub yeməkdən yeyər. Kim dəvətçinin dəvətini qəbul etməzsə, nə evə girər, nə də yeməkdən yeyə bilər." (Mələklər) dedilər: "Bu misalı ona yozun ki, onu başa düşsün." Bəziləri: "O yatıb"– dedilər, bəziləri də: "(Onun) gözləri yatsa da, qəlbi oyaqdır"– dedilər. Sonra (mələklər bunu) belə izah etdilər: "O ev – Cənnətdir, dəvətçi isə Muhəmməddir ﷺ. Kim Muhəmmədə ﷺ itaət etsə, Allaha itaət etmiş olar, kim Muhəmmədə ﷺ asi olarsa, Allaha asi olmuş olar. Muhəmməd ﷺ insanları bir-birindən ayırmışdır[1]". (əl-Buxari, 7281)

---

[1] Yəni möminləri kafirlərdən ayırmışdır.

## ٢– باب: مَا يُكْرَهُ مِنْ كَثْرَةِ السُّؤَالِ وَتَكَلُّفِ مَا لاَ يَعْنِيه

## 2-ci fəsil. Çox sual verməyin, habelə lazımsız işlərə baş qoşmağın bəyənilməməsi

٢٢٠٦ – عَنْ أَنَسِ بْنِ مَالِك ﷺ قَالَ: قَالَ رَسُولُ اللَّه ﷺ لَنْ يَبْرَحَ النَّاسُ يَتَسَاءَلُونَ حَتَّى يَقُولُوا هَذَا اللَّهُ خَالِقُ كُلِّ شَيْءٍ فَمَنْ خَلَقَ اللَّهَ. [رواه البخاري: ٧٢٩٦]

**2206.** Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İnsanlar bir-birilərinə o qədər sual verəcəklər ki, axırda deyəcəklər: "Baxın, Allah hər şeyi yaratmışdır. Bəs Allahı kim yaratmışdır?" (əl-Buxari, 7296)

## ٣– باب: مَا يُذْكَرُ مِنْ ذَمِّ الرَّأْيِ وَتَكَلُّفِ الْقِيَاسِ

## 3-cü fəsil. Fikir yürütməyin pislənməsi və qiyas[1] yolu ilə mühakimə yürütmək haqqında deyilənlər

٢٢٠٧ – عَنْ عَبْد اللَّه بْنِ عَمْرٍو ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: إِنَّ اللَّهَ لاَ يَنْزِعُ الْعِلْمَ بَعْدَ أَنْ أَعْطَاكُمُوهُ انْتِزَاعًا وَلَكِنْ يَنْتَزِعُهُ مِنْهُمْ مَعَ قَبْضِ الْعُلَمَاءِ بِعِلْمِهِمْ فَيَبْقَى نَاسٌ جُهَّالٌ يُسْتَفْتَوْنَ فَيُفْتُونَ بِرَأْيِهِمْ فَيُضِلُّونَ وَيَضِلُّونَ. [رواه البخاري: ٧٣٠٧]

**2207.** Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm. Allah elmi sizə bəxş etdikdən sonra onu (qəlblərinizdən) silib götürməz. Lakin bunu etmək istədikdə insanlar arasındakı alimləri onların elmi ilə bərabər aradan götürər, axıra isə cahil adamlar qalar. (Camaat onlardan) fitva soruşar və onlar öz fikirlərini yürüdərək fitva verərlər, beləliklə həm özləri zəlalətə düşər, həm də (camaatı) zəlalətə salarlar." (əl-Buxari, 7307)

## ٤– باب: قَوْلُ النَّبِيِّ ﷺ لَتَتْبَعُنَّ سَنَنَ مَنْ كَانَ قَبْلَكُمْ

## 4-cü fəsil. Peyğəmbərin ﷺ: "Siz özünüzdən əvvəlkilərin yolunu tutub gedəcəksiniz" sözü

٢٢٠٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ عَنْ النَّبِيِّ ﷺ قَالَ: لاَ تَقُومُ السَّاعَةُ حَتَّى تَأْخُذَ أُمَّتِي بِأَخْذِ الْقُرُونِ قَبْلَهَا شِبْرًا بِشِبْرٍ وَذِرَاعًا بِذِرَاعٍ فَقِيلَ يَا رَسُولَ اللَّهِ كَفَارِسَ وَالرُّومِ فَقَالَ وَمَنْ النَّاسُ إِلاَّ أُولَئِكَ. [رواه البخاري: ٧٣١٩]

**2208.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənim ümmətim özlərindən əvvəlki ümmətlərin yolunu tutub qarış-qarış, ərəş-ərəş[2] getməyincə, Qiyamət qopmayacaq." (Əshabələr) soruşdular: "Ya Rəsulullah, farslar və rumlular kimi (millətləri qəsd edirsən)?" Dedi: "Onlardan başqa kim ola bilər?!" (əl-Buxari, 7319)

---

[1] Bir şeyi başqa bir şeyə bənzədərək və ya onunla müqayisə edərək hökm vermə.
[2] 311-ci hədisin qeydlərinə bax.

## 5-ci fəsil. (Zina etmiş) evli (kişi və qadının) daşqalaq edilməsi

## ٥- باب: الرَّجْمُ لِلْمُحْصَنِ

٢٢٠٩ – عَنْ عُمَرَ ﷺ قَالَ: إِنَّ اللَّهَ بَعَثَ مُحَمَّدًا ﷺ بِالْحَقِّ وَأَنْزَلَ عَلَيْهِ الْكِتَابَ فَكَانَ فِيمَا أُنْزِلَ آيَةُ الرَّجْمِ. [رواه البخاري: ٧٣٢٣]

**2209.** Rəvayət edilir ki, Ömər ﷺ demişdir: "Həqiqətən, Allah Muhəmmədi ﷺ haqq (din) ilə göndərmiş və ona Kitab nazil etmişdir. Nazil etdiyi (Kitabda) daşqalaq ayəsi var idi." (əl-Buxari, 7323)

## 6-cı fəsil. Hakimin ictihad edib düz, yaxud səhv mühakimə yürütdüyü təqdirdə savab qazanması

## ٦- باب: أَجْرُ الْحَاكِمِ إِذَا اجْتَهَدَ فَأَصَابَ أَوْ أَخْطَأَ

٢٢١٠ – عَنْ عَمْرِو بْنِ الْعَاصِ ﷺ أَنَّهُ سَمِعَ رَسُولَ اللَّهِ ﷺ يَقُولُ: إِذَا حَكَمَ الْحَاكِمُ فَاجْتَهَدَ ثُمَّ أَصَابَ فَلَهُ أَجْرَانِ وَإِذَا حَكَمَ فَاجْتَهَدَ ثُمَّ أَخْطَأَ فَلَهُ أَجْرٌ. [رواه البخاري: ٧٣٥٢]

**2210.** Amr ibn As ﷺ rəvayət etmişdir ki, o, Peyğəmbərin ﷺ belə dediyini eşitmişdir: "Əgər hakim hökm verdiyi zaman ictihad etsə, sonra da verdiyi hökm düz çıxsa, iki savab qazanar. Əgər hökm verdiyi zaman ictihad etsə, sonra da verdiyi hökm səhv olsa, bir savab qazanar." (əl-Buxari, 7352)

## 7-ci fəsil. Başqa birisinin deyil, məhz Peyğəmbərin ﷺ tərk etdiyi bir şeyi dəlil olaraq götürən kimsə

## ٧- باب: مَنْ رَأَى تَرْكَ النَّكِيرِ مِنْ النَّبِيِّ ﷺ حُجَّةً لاَ مِنْ غَيْرِهِ

٢٢١١ – عَنْ مُحَمَّد بْنِ الْمُنْكَدِرِ قَالَ: رَأَيْتُ جَابِرَ بْنَ عَبْد اللَّه ﷺ يَحْلِفُ بِاللَّه أَنَّ ابْنَ الصَّائد الدَّجَّالُ قُلْتُ تَحْلِفُ بِاللَّهِ قَالَ إِنِّي سَمِعْتُ عُمَرَ يَحْلِفُ عَلَى ذَلِكَ عِنْدَ النَّبِيِّ ﷺ فَلَمْ يُنْكِرْهُ النَّبِيُّ ﷺ. [رواه البخاري: ٧٣٥٥]

**2211.** Rəvayət edilir ki, Muhəmməd ibn Munkədir demişdir: "Mən Cabir ibn Abdullahın ﷺ ibn Saidin dəccal olduğuna and içdiyini eşidib dedim: "Sən Allaha and içirsən?!" Dedi: "Mən Ömərin Peyğəmbərin ﷺ yanında (ibn Saidin dəccal) olduğuna dair and içdiyini eşitdim. Peyğəmbər ﷺ ona etiraz etmədi." (əl-Buxari, 7355)

# ٩٥ – كِتَابُ التَّوْحِيدِ

# 95 – Tövhid kitabı

## ١– باب: مَا جَاءَ فِي دُعَاءِ النَّبِيِّ ﷺ أُمَّتَهُ إِلَى تَوْحِيدِ اللَّهِ

## 1-ci fəsil. Peyğəmbərin ﷺ öz ümmətini Allahın təkliyini qəbul etməyə çağırması

٢٢١٢ – عَنْ عَائِشَةَ رضي الله عنها زَوْجِ النَّبِيِّ ﷺ أَنَّ النَّبِيَّ ﷺ بَعَثَ رَجُلاً عَلَى سَرِيَّةٍ وَكَانَ يَقْرَأُ لأَصْحَابِهِ فِي صَلاَتِهِمْ فَيَخْتِمُ بِقُلْ هُوَ اللَّهُ أَحَدٌ فَلَمَّا رَجَعُوا ذَكَرُوا ذَلِكَ لِلنَّبِيِّ ﷺ فَقَالَ سَلُوهُ لأَيِّ شَيْءٍ يَصْنَعُ ذَلِكَ فَسَأَلُوهُ فَقَالَ لأَنَّهَا صِفَةُ الرَّحْمَنِ وَأَنَا أُحِبُّ أَنْ أَقْرَأَ بِهَا فَقَالَ النَّبِيُّ ﷺ أَخْبِرُوهُ أَنَّ اللَّهَ يُحِبُّهُ. [رواه البخاري: ٧٣٧٥]

**2212.** Peyğəmbərin ﷺ zövcəsi Aişə رضي الله عنها rəvayət etmişdir ki, (bir dəfə) Peyğəmbər ﷺ bir nəfəri qoşuna başçı təyin edib (döyüşə) göndərdi. Həmin adam dostlarına qıldırdığı namazı hər dəfə: "De: "O Allah Təkdir!" (surəsi)[1] ilə bitirərdi. Əshabələr geri döndükdə bu haqda Peyğəmbərə ﷺ xəbər verdilər. Peyğəmbər ﷺ dedi: "Nə üçün belə etdiyini ondan soruşun." Onlar bunun səbəbini ondan soruşduqda o dedi: "Çünki bu surə ər-Rəhmanı vəsf edir. Mən də onu oxumağı çox sevirəm." Peyğəmbər ﷺ buyurdu: "Ona bildirin ki, Allah da onu sevir." (əl-Buxari, 7375)

## ٢– باب: قَوْلُهُ تَعَالَى: ﴿إِنَّ ٱللَّهَ هُوَ ٱلرَّزَّاقُ ذُو ٱلْقُوَّةِ ٱلْمَتِينُ﴾

## 2-ci fəsil. Uca Allahın: "Həqiqətən, Allah ruzi verəndir, qüvvət Sahibidir, Mətindir"[2] sözü

٢٢١٣ – عَنْ أَبِي مُوسَى الأَشْعَرِيِّ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ مَا أَحَدٌ أَصْبَرُ عَلَى أَذًى سَمِعَهُ مِنَ اللَّهِ يَدَّعُونَ لَهُ الْوَلَدَ ثُمَّ يُعَافِيهِمْ وَيَرْزُقُهُمْ. [رواه البخاري: ٧٣٧٨]

**2213.** Əbu Musa əl-Əşari رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Eşitdiyi nalayiq sözlərə Allahdan daha çox səbir edən bir kimsə yoxdur. (Qulları) Onun övladı olduğunu iddia edirlər, O isə onlara can sağlığı və (çoxlu) ruzi verir." (əl-Buxari, 7378)

---

[1] "əl-İxlas" surəsi.
[2] "əz-Zariyat" surəsi, 58.

**3-cü fəsil. Uca Allahın: "O, Qüdrətlidir, Müdrikdir"[1], "Qüdrət sahibi olan Rəbbin pakdır, müşriklərin *Ona* aid etdikləri sifətlərdən uzaqdır"[2] və "qüdrət yalnız Allaha, Onun Elçisinə və möminlərə məxsusdur..."[3] sözü**

**٣– باب:**
**قَوْلُهُ تَعَالَى: ﴿وَهُوَ ٱلْعَزِيزُ ٱلْحَكِيمُ﴾**
**وَقَوْلُهُ: ﴿سُبْحَٰنَ رَبِّكَ رَبِّ ٱلْعِزَّةِ عَمَّا يَصِفُونَ﴾**
**وَقَوْلُهُ: ﴿وَلِلَّهِ ٱلْعِزَّةُ وَلِرَسُولِهِۦ﴾**

٢٢١٤ – عَنْ ابْنِ عَبَّاسٍ رضي الله عنهما أَنَّ النَّبِيَّ ﷺ كَانَ يَقُولُ أَعُوذُ بِعِزَّتِكَ الَّذِي لاَ إِلَهَ إِلاَّ أَنْتَ الَّذِي لاَ يَمُوتُ وَالْجِنُّ وَالإِنْسُ يَمُوتُونَ. [رواه البخاري: ٧٣٨٣]

**2214.** İbn Abbas رضي الله عنهما rəvayət etmişdir ki, Peyğəmbər ﷺ deyərdi: "Ey Özündən başqa heç bir məbud olmayan, heç vaxt ölməyən (Allahım), Sənin izzətinə sığınıram! (Sən Ölməzsən), halbuki cinlər və insanlar ölürlər.[4]" (əl-Buxari, 7383)

**4-cü fəsil. Uca Allahın: "Allah sizi Özündən çəkindirir"[5] və "Sən mənim qəlbimdə olanları bilirsən, mən isə Sənin Özündə olanları bilmirəm"[6] sözü**

**٤– باب: قَوْلُهُ تَعَالَى: ﴿وَيُحَذِّرُكُمُ ٱللَّهُ نَفْسَهُۥ﴾ وَ قَوْلُهُ تَعَالَى: ﴿تَعْلَمُ مَا فِى نَفْسِى وَلَآ أَعْلَمُ مَا فِى نَفْسِكَ﴾**

٢٢١٥ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه عَنْ النَّبِيِّ ﷺ قَالَ: لَمَّا خَلَقَ اللَّهُ الْخَلْقَ كَتَبَ فِي كِتَابِهِ وَهُوَ يَكْتُبُ عَلَى نَفْسِهِ وَهُوَ وَضْعٌ عِنْدَهُ عَلَى الْعَرْشِ إِنَّ رَحْمَتِي تَغْلِبُ غَضَبِي. [رواه البخاري: ٧٤٠٤]

**2215.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Allah məxluqatı yaratdığı zaman Öz yanında Ərşin üzərində yerləşən Kitabında Özünə aid belə yazmışdır: "Həqiqətən də, Mənim rəhmətim qəzəbimi üstələyir!" (əl-Buxari, 7404)

٢٢١٦ – عَنْ أَبِي هُرَيْرَةَ رضي الله عنه قَالَ: قَالَ النَّبِيُّ ﷺ يَقُولُ اللَّهُ تَعَالَى أَنَا عِنْدَ ظَنِّ عَبْدِي بِي وَأَنَا مَعَهُ إِذَا ذَكَرَنِي فَإِنْ ذَكَرَنِي فِي نَفْسِهِ ذَكَرْتُهُ فِي نَفْسِي وَإِنْ ذَكَرَنِي فِي مَلإٍ ذَكَرْتُهُ فِي مَلإٍ خَيْرٍ مِنْهُمْ وَإِنْ تَقَرَّبَ إِلَيَّ بِشِبْرٍ تَقَرَّبْتُ إِلَيْهِ ذِرَاعًا وَإِنْ تَقَرَّبَ إِلَيَّ ذِرَاعًا تَقَرَّبْتُ إِلَيْهِ بَاعًا وَإِنْ أَتَانِي يَمْشِي أَتَيْتُهُ هَرْوَلَةً. [رواه البخاري: ٧٤٠٥]

**2216.** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Uca Allah buyurur: "Mən qulumun barəmdəki zənni yanındayam, Məni yad etdikcə onunlayam. O Məni öz-özlüyündə yad etsə, Mən də onu Öz-Özlüyümdə yad edərəm. O məni camaatın yanında yad edərsə, Mən onu onlardan daha xeyirli bir toplumun (mələklərin) yanında yad edərəm. O Mənə bir qarış yaxınlaşsa, Mən

[1] "İbrahim" surəsi, 4.
[2] "əs-Saffat" surəsi, 180.
[3] "əl-Munafiqun" surəsi, 8.
[4] Transkripsiyası: Əuzu bi izzətikəlləzi lə ilahə illə əntəlləzi lə yəmut, vəl-cinnu vəl-insu yəmutun.
[5] "Ali-İmran" surəsi, 28.
[6] "əl-Maidə" surəsi, 116.

ona bir ərəş yaxınlaşaram. O Mənə bir ərəş yaxınlaşsa, Mən ona bir qulac yaxınlaşaram. O Mənə doğru yeriyərək gəlsə, Mən ona doğru yüyürərək gələrəm.” (əl-Buxari, 7405)

## 5-ci fəsil. Uca Allahın: “Onlar Allahın sözünü dəyişdirmək istəyirlər”[1] sözü

## ٥- باب: قَوْلُهُ تَعَالَى: ﴿يُرِيدُونَ أَن يُبَدِّلُوا۟ كَلَـٰمَ ٱللَّهِ﴾

٢٢١٧ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ أَنَّ رَسُولَ اللَّهِ ﷺ قَالَ: يَقُولُ اللَّهُ إِذَا أَرَادَ عَبْدِي أَنْ يَعْمَلَ سَيِّئَةً فَلاَ تَكْتُبُوهَا عَلَيْهِ حَتَّى يَعْمَلَهَا فَإِنْ عَمِلَهَا فَاكْتُبُوهَا بِمِثْلِهَا وَإِنْ تَرَكَهَا مِنْ أَجْلِي فَاكْتُبُوهَا لَهُ حَسَنَةً وَإِذَا أَرَادَ أَنْ يَعْمَلَ حَسَنَةً فَلَمْ يَعْمَلْهَا فَاكْتُبُوهَا لَهُ حَسَنَةً فَإِنْ عَمِلَهَا فَاكْتُبُوهَا لَهُ بِعَشْرِ أَمْثَالِهَا إِلَى سَبْعِ مِائَةِ ضِعْفٍ. [رواه البخاري: ٧٥٠١]

**2217.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Allah buyurur: “Qulum günah iş görmək istəsə, o günahı edənədək bunu onun əleyhinə yazmayın. Əgər o günah etsə, ancaq onun mislində günah yazın, yox, əgər Məndən qorxaraq bu işdən əl çəkərsə, ona bir savab yazın. Və əgər bir yaxşılıq etmək istəsə və onu yerinə yetirməsə, buna görə ona bir savab yazın, əgər onu yerinə yetirərsə, ona bunun on mislindən yeddi yüz qatınadək savab yazın.” (əl-Buxari, 7501)

٢٢١٨ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ قَالَ: إِنَّ عَبْدًا أَصَابَ ذَنْبًا وَرُبَّمَا قَالَ أَذْنَبَ ذَنْبًا فَقَالَ رَبِّ أَذْنَبْتُ وَرُبَّمَا قَالَ أَصَبْتُ فَاغْفِرْ لِي فَقَالَ رَبُّهُ أَعَلِمَ عَبْدِي أَنَّ لَهُ رَبًّا يَغْفِرُ الذَّنْبَ وَيَأْخُذُ بِهِ غَفَرْتُ لِعَبْدِي ثُمَّ مَكَثَ مَا شَاءَ اللَّهُ ثُمَّ أَصَابَ ذَنْبًا أَوْ أَذْنَبَ ذَنْبًا فَقَالَ رَبِّ أَذْنَبْتُ أَوْ أَصَبْتُ آخَرَ فَاغْفِرْهُ فَقَالَ أَعَلِمَ عَبْدِي أَنَّ لَهُ رَبًّا يَغْفِرُ الذَّنْبَ وَيَأْخُذُ بِهِ غَفَرْتُ لِعَبْدِي ثُمَّ مَكَثَ مَا شَاءَ اللَّهُ ثُمَّ أَذْنَبَ ذَنْبًا وَرُبَّمَا قَالَ أَصَابَ ذَنْبًا قَالَ قَالَ رَبِّ أَصَبْتُ أَوْ قَالَ أَذْنَبْتُ آخَرَ فَاغْفِرْهُ لِي فَقَالَ أَعَلِمَ عَبْدِي أَنَّ لَهُ رَبًّا يَغْفِرُ الذَّنْبَ وَيَأْخُذُ بِهِ غَفَرْتُ لِعَبْدِي ثَلاَثًا فَلْيَعْمَلْ مَا شَاءَ. [رواه البخاري: ٧٥٠٧]

**2218.** Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: “(Bir dəfə Allahın qullarından) biri günah iş gördü və: “Ey Rəbbim, mən günah iş gördüm, məni bağışla!”– dedi.” Rəbbi dedi: “Mənim qulum bilir ki, onun günahları bağışlayan və onlara görə cəza verən Rəbbi vardır. Mən onu bağışlayıram.” Bu adam Allahın istədiyi qədər (günah işlətmədən) yaşadıqdan sonra yenə günah iş gördü və: “Ey Rəbbim, mən yenə günah iş gördüm, günahımı bağışla!”– dedi.” (Allah) dedi: “Mənim qulum bilir ki, onun günahları bağışlayan və onlara görə cəza verən Rəbbi vardır. Mən onu bağışlayıram.” Bu adam Allahın istədiyi qədər yaşadıqdan sonra bir daha günah iş gördü və: “Ey Rəbbim, mən yenə günah iş gördüm, günahımı bağışla!”– dedi.” (Allah) dedi: “Mənim qulum bilir ki, onun günahları bağışlayan və onlara görə cəza verən Rəbbi vardır. Mən onu üç dəfə bağışladım. (Bundan sonra) istədiyini edə bilər.” (əl-Buxari, 7507)

[1] “əl-Fəth” surəsi, 15.

## 6-cı fəsil. Qüdrətli və əzəmətli Rəbbin Qiyamət günü peyğəmbərlərə və qeyrilərinə xitab etməsi

## ٦– باب: كَلاَمُ الرَّبِّ ﷻ يَوْمَ الْقِيَامَةِ مَعَ الأَنْبِيَاءِ وَغَيْرِهِمْ

٢٢١٩ – عَنْ أَنَسٍ ﵁ قَالَ: سَمِعْتُ النَّبِيَّ ﷺ يَقُولُ: إِذَا كَانَ يَوْمُ الْقِيَامَةِ شُفِّعْتُ فَقُلْتُ يَا رَبِّ أَدْخِلِ الْجَنَّةَ مَنْ كَانَ فِي قَلْبِهِ خَرْدَلَةٌ فَيَدْخُلُونَ ثُمَّ أَقُولُ أَدْخِلِ الْجَنَّةَ مَنْ كَانَ فِي قَلْبِهِ أَدْنَى شَيْءٍ فَقَالَ أَنَسٌ: كَأَنِّي أَنْظُرُ إِلَى أَصَابِعِ رَسُولِ اللَّهِ ﷺ. [رواه البخاري: ٧٥٠٩]

**2219.** Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Qiyamət günü yetişdikdə mənə havadarlıq etmək hüququ veriləcəkdir. Onda mən: "Ey Rəbbim, qəlbində xardal dənəsi boyda imanı olan kimsələri Cənnətə daxil et!"– deyəcəm və onlar (Cənnətə) daxil olacaqlar. Sonra mən: "Qəlbində xardal dənəsindən az imanı olan kimsələri Cənnətə daxil et!"– deyəcəyəm."

Ənəs dedi: "İndi də Peyğəmbərin ﷺ barmaqları gözlərim önündədir." (əl-Buxari, 7509)

٢٢٢٠ – عَنْ أَنَسٍ ﵁ قَالَ: حَدَّثَنَا مُحَمَّدٌ ﷺ قَالَ: إِذَا كَانَ يَوْمُ الْقِيَامَةِ مَاجَ النَّاسُ بَعْضُهُمْ فِي بَعْضٍ فَيَأْتُونَ آدَمَ فَيَقُولُونَ اشْفَعْ لَنَا إِلَى رَبِّكَ فَيَقُولُ لَسْتُ لَهَا وَلَكِنْ عَلَيْكُمْ بِإِبْرَاهِيمَ فَإِنَّهُ خَلِيلُ الرَّحْمَنِ فَيَأْتُونَ إِبْرَاهِيمَ فَيَقُولُ لَسْتُ لَهَا وَلَكِنْ عَلَيْكُمْ بِمُوسَى فَإِنَّهُ كَلِيمُ اللَّهِ فَيَأْتُونَ مُوسَى فَيَقُولُ لَسْتُ لَهَا وَلَكِنْ عَلَيْكُمْ بِعِيسَى فَإِنَّهُ رُوحُ اللَّهِ وَكَلِمَتُهُ فَيَأْتُونَ عِيسَى فَيَقُولُ لَسْتُ لَهَا وَلَكِنْ عَلَيْكُمْ بِمُحَمَّدٍ ﷺ فَيَأْتُونِي فَأَقُولُ أَنَا لَهَا فَأَسْتَأْذِنُ عَلَى رَبِّي فَيُؤْذَنُ لِي وَيُلْهِمُنِي مَحَامِدَ أَحْمَدُهُ بِهَا لاَ تَحْضُرُنِي الآنَ فَأَحْمَدُهُ بِتِلْكَ الْمَحَامِدِ وَأَخِرُّ لَهُ سَاجِدًا فَيَقُولُ يَا مُحَمَّدُ ارْفَعْ رَأْسَكَ وَقُلْ يُسْمَعْ لَكَ وَسَلْ تُعْطَ وَاشْفَعْ تُشَفَّعْ فَأَقُولُ يَا رَبِّ أُمَّتِي أُمَّتِي فَيَقُولُ انْطَلِقْ فَأَخْرِجْ مِنْهَا مَنْ كَانَ فِي قَلْبِهِ مِثْقَالُ شَعِيرَةٍ مِنْ إِيمَانٍ فَأَنْطَلِقُ فَأَفْعَلُ ثُمَّ أَعُودُ فَأَحْمَدُهُ بِتِلْكَ الْمَحَامِدِ ثُمَّ أَخِرُّ لَهُ سَاجِدًا فَيُقَالُ يَا مُحَمَّدُ ارْفَعْ رَأْسَكَ وَقُلْ يُسْمَعْ لَكَ وَسَلْ تُعْطَ وَاشْفَعْ تُشَفَّعْ فَأَقُولُ يَا رَبِّ أُمَّتِي أُمَّتِي فَيَقُولُ انْطَلِقْ فَأَخْرِجْ مِنْهَا مَنْ كَانَ فِي قَلْبِهِ مِثْقَالُ ذَرَّةٍ أَوْ خَرْدَلَةٍ مِنْ إِيمَانٍ فَأَنْطَلِقُ فَأَفْعَلُ ثُمَّ أَعُودُ فَأَحْمَدُهُ بِتِلْكَ الْمَحَامِدِ ثُمَّ أَخِرُّ لَهُ سَاجِدًا فَيَقُولُ يَا مُحَمَّدُ ارْفَعْ رَأْسَكَ وَقُلْ يُسْمَعْ لَكَ وَسَلْ تُعْطَ وَاشْفَعْ تُشَفَّعْ فَأَقُولُ يَا رَبِّ أُمَّتِي أُمَّتِي فَيَقُولُ انْطَلِقْ فَأَخْرِجْ مَنْ كَانَ فِي قَلْبِهِ أَدْنَى أَدْنَى أَدْنَى مِثْقَالِ حَبَّةِ خَرْدَلٍ مِنْ إِيمَانٍ فَأَخْرِجْهُ مِنَ النَّارِ فَأَنْطَلِقُ فَأَفْعَلُ.

وَفِي رِوَايَةٍ عَنْهُ قَالَ: ثُمَّ أَعُودُ الرَّابِعَةَ فَأَحْمَدُهُ بِتِلْكَ الْمَحَامِدِ ثُمَّ أَخِرُّ لَهُ سَاجِدًا فَيُقَالُ يَا مُحَمَّدُ ارْفَعْ رَأْسَكَ وَقُلْ يُسْمَعْ وَسَلْ تُعْطَهْ وَاشْفَعْ تُشَفَّعْ فَأَقُولُ يَا رَبِّ ائْذَنْ لِي فِيمَنْ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ فَيَقُولُ وَعِزَّتِي وَجَلاَلِي وَكِبْرِيَائِي وَعَظَمَتِي لأُخْرِجَنَّ مِنْهَا مَنْ قَالَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ. [رواه البخاري: ٧٥١٠]

**2220.** Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Muhəmməd ﷺ bizə belə rəvayət etmişdir: "Qiyamət günü insanların arasına çaxnaşma düşəcək. (Nəhayət,) onlar Adəmin yanına gəlib deyəcəklər: "(Ey Adəm!) Rəbbinin yanında bizdən ötrü havadarlıq et (şəfaətçi ol)!" (Adəm) deyəcək: "Mən buna layiq deyiləm. Lakin siz İbrahimin yanına gedin. Həqiqətən, o, Mərhəmətli Allahın ən sevimli dostudur." Sonra onlar İbrahimin yanına gələcəklər. İbrahim deyəcək: "Mən buna layiq deyiləm. Lakin siz Musanın yanına gedin. Həqiqətən, o, Allahın (bilavasitə) danışdığı (bir adamdır)." Sonra onlar Musanın yanına gələcəklər. Musa deyəcək: "Mən buna layiq deyiləm. Lakin siz İsanın yanına gedin. Həqi-

qətən, o, Allahın ruhudur və Onun Kəlməsidir[1]". Bundan sonra onlar İsanın yanına gələcəklər. İsa deyəcək: "Mən buna layiq deyiləm. Lakin siz Muhəmmədin ﷺ yanına gedin." Beləliklə, onlar mənim yanıma gələcəklər. Onda mən deyəcəyəm: "Mən buna layiqəm!" Sonra mən Rəbbimdən izn istəyəcəyəm və mənə izn veriləcəkdir. Sonra Allah mənə indi bilmədiyim həmd-sənaları təlqin edəcək və mən o həmd-sənalarla Ona tariflər deyəcəyəm və səcdəyə qapanacağam. Onda Allah buyuracaq: "Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq." Mən deyəcəyəm: "Ey Rəbbim! Ümmətim, ümmətim!" Allah buyuracaq: "Get, qəlbində arpa dənəsi ağırlığında imanı olan kimsələri atəşdən çıxart!" Mən gedib onları (oradan) çıxardacağam. Sonra geri dönüb həmin həmd-sənalarla Allaha tariflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: "Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq." Mən deyəcəyəm: "Ey Rəbbim! Ümmətim, ümmətim!" Allah buyuracaq: "Get, qəlbində zərrə qədər və ya xardal dənəsi ağırlığında imanı olan kimsələri atəşdən çıxart!" Mən gedib onları (oradan) çıxardacağam. Sonra geri qayıdıb həmin həmd-sənalarla Allaha tariflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: "Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq." Mən deyəcəyəm: "Ey Rəbbim! Ümmətim, ümmətim!" Allah buyuracaq: "Get, qəlbində xardal dənəsi ağırlığından daha az, daha az, daha az imanı olan kimsələri atəşdən çıxart!" Mən gedib onları (oradan) çıxardacağam."

Digər rəvayətdə Peyğəmbər ﷺ demişdir: "Mən dördüncü dəfə qayıdıb həmin həmd-sənalarla Allaha tariflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: "Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq." Mən deyəcəyəm: "Ey Rəbbim! Mənə izn ver: "Lə ilahə illəllah!"– deyən kimsələrə (şəfaətçi) olum." Allah buyuracaq: "Mənim izzətimə, əzəmətimə, böyüklüyümə və ululuğuma and olsun ki, Mən: "Lə ilahə illəllah!"– deyən kəsləri oddan çıxardacağam." (əl-Buxari, 7510)

## 7-ci fəsil. Qiyamət günü əməllərin və deyilən sözlərin əməl tərəzisində çəkilməsi

## ٧– باب: مِيْزَانُ الأَعْمَالِ وَ الأَقْوَالِ يَومَ القِيَامَةِ

٢٢٢١ – عَنْ أَبِي هُرَيْرَةَ ﷺ قَالَ: قَالَ النَّبِيُّ ﷺ كَلِمَتَانِ حَبِيبَتَانِ إِلَى الرَّحْمَنِ خَفِيفَتَانِ عَلَى اللِّسَانِ ثَقِيلَتَانِ فِي الْمِيزَانِ سُبْحَانَ اللَّهِ وَبِحَمْدِهِ سُبْحَانَ اللَّهِ الْعَظِيمِ. [رواه البخاري: ٧٥٦٣]

**2221.** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mərhəmətli Allaha sevimli, tələffüzü asan və tərəzidə ağır gələn iki kəlmə (vardır ki, bunlar): "Sübhanəllahi və bihəmdihi, subhanəllahil-əzim!"[2] (kəlmələridir)." (əl-Buxari, 7563)

[1] 1744-cü hədisə bax.

[2] Tərcüməsi: Allah pak və müqəddəsdir! Allaha həmd olsun! Böyük Allah pak və müqəddəsdir!

# KİTABIN İÇİNDƏKİLƏR

## 7 – Təyəmmüm kitabı ........ 81



## 8 – Namaz kitabı ........ 85

## 10 – Azan kitabı........................................................................137

## 24 – Zəkat kitabı ........................................................................ 258

